AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI

NƏSİMİ ADINA DİLÇİLİK İNSTİTUTU

# AZƏRBAYCAN DİLİNİN İZAHLI LÜĞƏTİ

DÖRD CİLDDƏ

II Cild

EƏFGHXİJK

ŞƏRQ-QƏRB

BAKI 2006

*Bu kitab "Azərbaycan dilinin izahlı lüğəti" I cild* (*Bakı, Azərbaycan Elmlər Akademiyası nəşriyyatı, 1966*), *II cild* (*Bakı, Elm, 1980*), *III cild* (*Bakı, Elm, 1983*) *və IV cild* (*Bakı, Elm, 1987*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü,
filologiya elmləri doktoru, professor
**Əliheydər Orucovun**
rəhbərliyi və ümumi redaktəsi ilə

Tərtibçilər:

**Əliheydər Orucov, Bəhruz Abdullayev, Nərgiz Rəhimzadə**

Nəşrə hazırlayanı, təkmilləşdirəni və redaktoru:

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü
filologiya elmləri doktoru, professor
**Ağamusa Axundov**

**494.36131-dc21**
**AZE**
**Azərbaycan dilinin izahlı lüğəti.** Dörd cilddə. II cild. Bakı, "Şərq-Qərb", 2006, 792 səh.

**ISBN10 9952-34-024-9**
**ISBN13 978-9952-34-024-2**

# Ee

**E**[1] Azərbaycan əlifbasının altıncı hərfi və bu hərflə işarə olunan saitin adı.

**E**[2] *nida* Etiraz, narazılıq bildirir (adətən, uzadılaraq deyilir). *E, yenə gəldin! E, bu sözü yenə təkrarladın!*

**EBONİ́T** [*yun.*] *tex.* Müxtəlif maddələrin hazırlanmasında geniş tətbiq olunan və elektrotexnikada izolyasiya materialı kimi istifadə edilən vulkanizə edilmiş rezin qatışıqlarından alınan bərk maddə. // Ebonitdən qayrılmış. *Ebonit borucuq.*

**ECAZ** *is.* [*ər.*] 1. *klas.* Möcüzə, misli görünməmiş şey, xariqə. [İkinci kəndli:] *Minası demə! Onun işi ecazdır, ecaz!* Ə.Haqverdiyev. *Dünyada sənətin yeddi ecazından biri olan "Tac Mahal" məqbərəsi də buradadır.* M.İbrahimov. *Ecazlar yaradır, hünər göstərir; Ona bu qüdrəti Vətən, el verir.* M.Rahim.

2. *köhn.* Nitqdə fəsahətli olma.

**ECAZKAR** *sif.* [*ər.* ecaz və *fars.* ...kar] Xariqülادə, möcüzələr yaradan, hər kəsi heyrətə salan. ..[Kərim xanın] *sağlam vücudu ecazkar bir surətdə öz həyat qüvvəsini göstərirdi.* M.İbrahimov. *Bu daxili həyəcan, ecazkar bir qüdrətlə bütün şagirdləri .. ürəkdən tərpədir və bütün gücü ilə tutub silkələyirdi.* S.Rəhimov. *Aradan uzun, .. xeyli uzun illər keçmişdir. Lakin sənətin o ecazkar səsi unudulmamışdır.* İ.Əfəndiyev.

**EDADI** [*ər.*]: **edadı məktəb** – 1917-ci il aprel inqilabından sonra ibtidai və rüşdiyyə məktəblərindən sonra gələn və şagirdləri ali məktəbə hazırlayan məktəbin köhnə adı. [Rzaqulu xan:] *24 sinlərinə qədər Fransanın ibtidai və edadı məktəblərində hazırlandıqdan sonra məşhur Sarbon darülfününuna daxil olmuşdu.* M.S.Ordubadi. *Bu və ya başqa maneələrə baxmayaraq, edadı məktəbə girməyimiz üçün təlaş edən elm dostları bizi realnı məktəbinə imtahan verməyə gətirdilər.* T.Ş.Simurq.

**EDADİYYƏ** [*ər.*]: **edadiyyə məktəbi** – b a x **edadı**. *Mirzə Səfərin iki oğlu edadiyyə məktəbinin beşinci sinfində oxuyurdu.* Ə.Haqverdiyev.

**EDAM** *is.* [*ər.*] Yüksək məhkəmə cəzası üsulu olaraq öldürmə; ölüm cəzası, dar ağacından asma. *Edam cəzası. – Qətibənin Fəxrəddinə qarşı hazırladığı sui-qəsd və Gözəlin oğlanlarının edamı üçün etdiyi təşəbbüslər Atabəy Məhəmməd üçün əvvəldən axıra qədər məlum idi.* M.S.Ordubadi. ☐ **Edam etmək** – yüksək cəza olaraq öldürmək, yox etmək, ölüm cəzasını yerinə yetirmək. [Vəzir Keykavusa:] *Bəli, hərəmdir, əvət, edam etsəniz; Müztərib olacaq bundan ölkəmiz.* H.Cavid. **Edam olunmaq (edilmək)** – yüksək cəza olaraq öldürülmək, yox edilmək.

**EDİ** *məh.* b a x **ağı**[2]. ☐ **Edi demək (çəkmək)** – b a x **ediləmək**.

**EDİCİ** *is. məh. köhn.* Yasxanada ağı deyən; ağıçı. *– Dün o da bir şübhəli kəslə danışıb. – Kim deyirdi? – Edici Xansənəm arvadın əri.* M.Ə.Sabir.

**...edici** Bəzi sözlərə qoşularaq, mürəkkəb sifətlər əmələ gətirir; məs.: təsiredici, emaledici, rahatedici, həlledici.

**EDİLƏMƏK** *f. məh.* Edi demək, ağı demək, ağız açmaq.

**EDİLƏŞMƏ** "Ediləşmək"dən *f.is.*

**EDİLƏŞMƏK** *qarş. məh. köhn.* Ağız-ağıza verib edi söyləmək, ağı demək.

**EDİLMƏ** "Edilmək"dən *f.is.*

**EDİLMƏK** "Etmək"dən *məch. Güllələr atılır, hədələr edilir, amma yaxın gəlməyə cürət edən bir adam görünmürdü.* Mir Cəlal.

**EDİLMİŞ** *f.sif.* Yerinə yetirilmiş, əmələ gətirilmiş, görülmüş. *Edilmiş cinayət.*

**EDİŞ** *is.* Etmək işi, etmə. *Onu təqib edişim hər halda münasib bir hərəkət deyildi.* S.Hüseyn.

**EFFÉKT** [*lat.*] 1. Təsir, nəticə. [Hüseyn:] *İndi görürsənmi, heyvanı necə boğmaq lazımdır ki, effekt olsun?* Ə.Haqverdiyev.

2. Hər hansı hərəkətin, fəaliyyətin və ya səbəbin nəticəsi. *İqtisadi effekt. İstehsalat effekti.*

**EFFEKTİVLİK** *is.* Təsirlilik, təsir bağışlama qabiliyyəti, dərəcəsi. *Tamaşanın effektivliyi.* // Nəticə, nəticəlilik. *Tədbirin effektivliyi. Əmək məhsuldarlığının effektivliyi.*

**EFFEKTLİ** *sif.* 1. Təsirli, güclü təsir, effekt bağışlayan, effekt yaradan. *Xüsusən finalda bol meyvəli alma ağaclarının bir-birinin*

*dalınca səhnəyə doğru enməsi əsərin məzmunu ilə həmahəng və effektlidir.* M.Arif.

2. Lazımi nəticə verən, istənilən nəticəni verən. *Atom enerjisindən xalq təsərrüfatının bir sıra sahələrində də* (*xüsusən biologiya ilə əlaqədar*) *çox ucuz və effektli təsiri olan atomun bölünməsi məhsulları şəklində geniş istifadə edilməkdədir.* A.Qarayev.

**EFİ́R** [*yun.*] 1. Qədim yunanların təsəvvürüncə: havanın ən yuxarı, sadə, təmiz və şəffaf təbəqəsi.

2. Dünyanı əhatə edən hava, radiodalğalarının yayıldığı fəza. *Efir iclas salonunun təntənəli səsini xəbər verdi.* Ə.Vəliyev. *Efirdə qarışıb səslər səslərə; Yalanlar titrəyir; Əsir havada.* B.Vahabzadə.

3. Keçmişdə təsəvvür edildiyinə görə, havadan daha xəfif olub, fəzanı dolduran işıq, hərarət, elektrik və s.-nin yayılması üçün vasitə olan axıcı cisim, maddə.

4. *kim.* Xarakter iyi olan rəngsiz uçucu maddə, üzvi birləşmə (təbabətdə, ətriyyat istehsalında, texnikada işlənir). *Efir iyi.*

◊ **Efir yağı** – bəzi bitkilərin tərkibində olan xoşiyli uçucu yağlı maye (sənayenin bəzi sahələrində və təbabətdə işlənir).

**EFİRLİ** *sif.* Tərkibində efir olan. *Efirli maddələr. Efirli bitkilər. Efirli dərman.*

**EH** *nida.* 1. Kədər, təəssüf, ümidsizlik, həsrət kimi hissləri ifadə edir. [Şərəfnisə:] *Eh, heç vaxt deyə bilmənəm ki, nədən ötrü ağlayırdım.* M.F.Axundzadə. ..[Kərim baba:] *çiyinlərini silkələyərək*: – *Eh! Adam qocalanda belə sözləri çox eşidər.* A.Şaiq. [Bəşirli] *indisə güzgüyə baxa-baxa dərindən köksünü ötürüb dedi*: – *Eh, qocaldıq..* Ə.Vəliyev.

2. Etinasızlıq, etiraz bildirir. *İndi müsəlman qardaş da bu cür sözləri eşidəndə, dinməz-söyləməz qəzeti bükür, qoyur kənara və "eh" deyib durur, gedir işinə.* C.Məmmədquluzadə. *Eh, bilsən də, bilməsən də eyniyik; Mənə qalsa, biz ayrılan deyilik.* Ə.Cavad.

**EHKAM** *is.* [*ər.* "hökm" söz. cəmi] 1. Hər hansı bir nəzəriyyənin (əsasən dini nəzəriyyənin) əsas qanunu. *İslam dininin ehkamları.* – *Peymani-fərhəngin ehkamından hər gün nədimlər padşaha oxurdular.* M.F.Axundzadə. *O kəs ki "Cameyi-Abbas" kitabında dərc olunan həmin şəriət ehkamından xəbərdar deyil, o kəs bu yazılan mətləbi layiqincə başa düşməyəcək.* C.Məmmədquluzadə. [Hacı:] *Cəmi millətlər ayılıb islam dininin mübarək ehkamlarından faydalanıblar.* Mir Cəlal.

2. Bütün tarixi şəraitlər və dövrlər üçün dəyişilməz və inkaredilməz həqiqət kimi qəbul edilən qanun. *Müstəbid zülmünü doğrultmaq üçün; Ehkamlar yaratdı, bütlər yaratdı.* B.Vahabzadə.

**EHKAMPƏRƏST** *sif.* [*ər.* ehkam və *fars.* ...pərəst] Qeyri-tənqidi düşünərək, hər şeyi ehkam kimi qəbul edən.

**EHKAMPƏRƏSTLİK** *is.* Qeyri-tənqidi düşünərək, hər şeyi ehkam kimi qəbul etmə.

**EHMAL** [*ər.*] 1. *zərf* Yavaş, yavaşca, sakit, asta, üsullu. *Qapını ehmal açmaq. Sözü ehmal demək.* – *Bir para söz də deyir ehmal kişi! Ağzıdualı, qoca baqqal kişi!* M.Ə.Sabir. *Novruzəli kağızı ehmal qoydu qoynuna..* C.Məmmədquluzadə. *Başımı yavaşca qovzayıb yan-yörəmə baxdım. Heyvan sümüyündən və zibilindən savayı bir şey görmədim. Ehmal qalxıb, Allahı çağıra-çağıra süründüm lağıma doğru.* Çəmənzəminli.

2. *is. klas.* Aldırmama, əhəmiyyət verməmə, fikir verməmə, etina etməmə, etinasızlıq, başısoyuqluq. *Tez çəkməzsən cəfa tiğin məni öldürməyə; Öldürər axir məni bir gün bu ehmalın sənin.* Füzuli. *Vüsali-yar biağyar, məclis xali, mey hazır; Nədir ehmalə bais, saqiya, öldüm, aman, doldur!* S.Ə.Şirvani.

□ **Ehmal etmək (eləmək**) – fikir verməmək, əhəmiyyət verməmək, etina etməmək, aldırmamaq, başısoyuqluq göstərmək. *..Əgər bir kəs cüzvi ehmal eləsə, başını və qolunu xurd edərlər.* M.F.Axundzadə. *Bağa doğru get, eyləmə ehmal; Oğrunu tap o yerdə, börkünü al.* M.Ə.Sabir.

**ehmal-ehmal** *zərf* Yavaş-yavaş, asta-asta, ağır-ağır; səs, gurultu salmadan. *Ehmal-ehmal danışmaq. Ehmal-ehmal yerimək.* – [Salman] *salam verib ocağın qırağındakı balaca döşəkcənin üstündə oturdu, ehmal-ehmal hıqqıldamağa başladı.* Ə.Vəliyev. *Bağır kimisə hürküdəcəyindən qorxurmuş təkin pilləkəni ehmal-ehmal qalxdı və qapının ağzında ayaq saxladı.* İ.Məlikzadə.

**EHMALCA** b a x **ehmallıca**. *Ehmalca ayağa qalxmaq. Ehmalca gülmək. – Sözü lazımdır ehmalca demək, "pişiyim-pişiyimnən" demək..* C.Məmmədquluzadə. *Ana ehmalca uşağı qucağına aldı.* M.Hüseyn. *Bir az sonra dizinin üstündə huşa getdiyini gördükdə Zeynəb* [Mayanı] *ehmalca yerinə uzatdı.* M.İbrahimov.

**EHMALDAN** *zərf* Yavaşdan, astadan, yavaş, asta, üsulluca. *Ehmaldan danışmaq. – Bəhram məktubu büküb gərəksiz bir vəsiqə kimi kitabların üstünə tulladı və çox ehmaldan dilləndi..* Ə.Vəliyev.

**EHMALLI** b a x **ehmal** 1-ci mənada. *Ehmallı tərpənmək. Ehmallı gəlmək. Şeyləri ehmallı düşürmək. – O, daşıqçılara yüklərin ehmallı düşürülməsini tapşırdı.* S.Rəhimov. *Sıralarda oturan sakit, top kimi sağlam kənd çocuqları müəllimlərinin xasiyyətinə alışmışdılar. Ona görə də çox zaman ehmallı gəlib, ehmallıca gedərdilər.* Mir Cəlal. *Qızılgül açıldı, uzadıb əl, dər! İncitmə yarpağı, ehmallı gəl, dər!* M.Rahim.

**EHMALLICA** *zərf* Sakitcə, astadan, yavaş-yavaş, ehtiyatla, üsulla. *Ehmallıca çıxıb getmək. Ehmallıca qapını döymək. – At sahibi ilə ev sahibi çuvalları atın üstündən ehmallıca alıb apardılar və sonra atı içəri çəkib qapını bağladılar.* Ə.Haqverdiyev. *Rüstəm bəy diksindi, qolunu ehmallıca xanımın qolundan xilas etdi.* Çəmənzəminli. *Ağaclar yetişmiş sarı, dolu, sulu, şirin armudu ehmallıca yerə buraxır.* Mir Cəlal.

**EHMALLIQ, EHMALLILIQ** *is.* Sakitlik, yavaşlıq, üsulluluq, ehtiyatlılıq. ..[Salman kişinin] *üslubunda kənd sakitliyi və ehmallılığı hakimdir.* Mir Cəlal.

**EHMALSIZ** *zərf* Ehtiyatsız, ehtiyat gözləmədən, üsulsuz. *Müqim bəy əlinin içi kimi bilirdi ki, ehmalsız tərpənib, deyinə-deyinə yuxuya gedən Zərrintac xanımı oyatsa, araya qan düşəcəkdir.* S.Rəhimov.

**EHMALSIZLIQ** *is.* Ehtiyatsızlıq, ehtiyat gözləməmə, üsulsuzluq.

**EHRAM¹** *is.* [*ər.*] Qədim Misirdə: fironların nəhəng məqbərəsi, sərdabəsi; piramida.

**EHRAM²** *is.* [*ər.*] 1. *din.* Hacılıq ziyarətinə gələnlərin Məkkəyə daxil olmaları və tələb olunan gerimə bürünmə mərasimi. . *Səfayikuyinə ehram bağlayan aşiq; Yeri var etməsə, ey şux, Kəbə içrə məqam.* S.Ə.Şirvani. // Ərəblərin büründükləri böyük ağ parça.

2. Bədəni qurutmaq üçün, xovlu böyük dəsmal.

**EHSAN** *is.* [*ər.*] 1. *din.* Ölmüş adamın adına, xatirəsinə verilən yemək; xeyrat. *Ehsan vermək. – Rəsul atasını layiqincə dəfn etdikdən sonra başladı ehsan verməyə.* "Aşıq Qərib". *Vəqta ki qopur bir evdə matəm; Təşkil edilir büsati-ehsan.* M.Ə.Sabir. *Bu yeddi günün ərzində plov qurşağa çıxdı; şəhərin hamı mollaları, boynuyoğunları, arvadları, uşaqları hər gün ehsanda cəm olurdular.* Ə.Haqverdiyev.

2. Savab məqsədi ilə bir şey (pul, yemək və s.) vermə. *İbrahimin anası, Hatəm, bir də Mələkxatın o gecə səhərə kimi şadyanalıq elədilər. Bütün fağır-füqəraya ehsan verildi.* (Nağıl). // Ehsan olaraq verilən, bağışlanan şey; bəxşiş, sədəqə. *Şərqdə hər cümə axşamı məhbuslara ehsan gətirmək adət idi.* M.S.Ordubadi. [Fərhad bəyin] *heç ağlına gəlməyirdi ki, Mirzə Möhsün kimi bir müəllim onun ehsanı olan taxıl-dəni rədd etsin.* Qantəmir.

3. *klas.* Lütf, mərhəmət, yaxşılıq. *Yar cövr etməz mana, əğyar təlim etmədən; Billah, əğyar eləyən ehsanı yar etməz mana.* Füzuli. *Bu Xətayi xəstənin vergil muradın, ya ilah; Kim mənə lütf eylə ehsan, səndən özgə kimsə yox.* Xətayi.

**EHSANÇI** *is.* Savab məqsədi ilə ehsan verən, ehsan edən adam. *Müdir ehsançı və səxavətli qadınla həddindən artıq maraqlanırdı.* M.S.Ordubadi.

**EHSAS** *is.* [*ər.*] *kit.* Duyma, hiss etmə; duyğu, hiss. *Ehsas etmək* (*duymaq*). *– Gözlərim bu qədər cinayəti görməkdən, beynim isə ehsas etmək və duymaqdan yorulmuşdu.* M.S.Ordubadi.

**EHSASAT** *is.* [*ər.* "ehsas" söz. cəmi] *kit.* Hisslər, duyğular. *XVI əsrdə Azərbaycan dili hər cür fəlsəfi fikirləri və dərin ehsasatı ifadə edəcək yüksəkliyə qalxmışdı.* M.İbrahimov. *"Könüldə fırtına"* (*şeirlər kitabı*) *pis ehsasat yaradır.* Ə.Vəliyev.

**EHTİKAR** *is.* [*ər.*] Mal, ərzaq və s.-ni ucuz qiymətə alıb sonradan baha qiymətlə satma işi. *"Taxıl, taxıl" deyib də, çox çığırma zəngəzurlu tək; Bəyin, xanın, xanın, bəyin əlində ehtikarı gör.* M.Ə.Sabir. *Novruz bəy özünün ehtikarındakı müvəffəqiyyətlərini xatırlayırdı.* S.Hüseyn. // Qanunsuz olaraq mal alıb varlanmaq məqsədi ilə onu baha qiymətə satma; alver. *Ərzaq malları ilə ehtikar. Ehtikar üstündə məhkəməyə cəlb edilmək.*

**EHTİKARÇI** *is.* Ehtikarla məşğul olan adam (b a x **ehtikar**). *Bəhayi dininə sadiq olanlar isə əksəriyyətlə böyük-kiçik tacir, ehtikarçı, dükançılardır.* M.S.Ordubadi. // Qanunsuz olaraq mal alıb varlanmaq məqsədi ilə onu baha qiymətlə satmaqla məşğul olan adam; alverçi.

**EHTİKARÇILIQ** *is.* Ehtikarla məşğul olma, möhtəkirlik etmə; alverçilik.

**EHTİMAL** *is.* [*ər.*] 1. Bir şeyin ola bilməsi, baş verə bilməsi, mümkünlüyü. *Onun bu gün gəlməyinə ehtimal azdır. – Natəvandır ol, bu təklifə yoxdur ehtimal.* Füzuli. *Əziz balalar!.. Həmin bağlı otaqda 30-40 nəfər adam bir neçə vaxt davam edərsə, axırda bəzi azarlara mübtəla olub həlak olmaqlarına ehtimal var.* N.Nərimanov.

2. Ara söz mənasında (çox vaxt "ki" bağlayıcısı ilə) – ola bilsin ki, yəqin ki, mümkündür. *Mən sizi 6-7 ay əvvəl, bir kişi ilə bərabər gəzən görərdim..* [O] *gözlərinə qara rəngli bir gözlük taxırdı. Ehtimal ki, gözləri görməyirdi.* S.Hüseyn. [Aydəmir:] *..Fəqət, ehtimal ki, mən atdığım dəymişdir..* C.Cabbarlı. *Ehtimal ki, o körpə heyvan balaca müsahibinin, onu yemləyib bəsləmək istəyən Baharın gəlməyini güman edib sevinmişdi.* Mir Cəlal.

3. Güman, təxmin, təsəvvür, fərziyyə. *Fəlakət zamanı ən kiçik bir ehtimal belə, insanın xəyalında min ümid oyadır.* M.İbrahimov. ☐ **Ehtimal etmək** – mümkün hesab etmək, zənn etmək, güman etmək, təsəvvür etmək.

◊ **Ehtimal nəzəriyyəsi** – riyaziyyatın külli miqdarda təsadüfi hadisələrin qarşılıqlı təsirinə əsaslanan qanunauyğunluqlarını öyrənən şöbəsi. *Təsadüfi hadisələrin ehtimallarını öyrənən elmə ehtimal nəzəriyyəsi deyilir.* Z.Xəlilov. **Hər (bir) ehtimala qarşı (görə)** – mümkün ola biləcək, baş verə biləcək hadisəni, vəziyyəti və s.-ni nəzərə alaraq göz önündə tutmaq. *Küçəyə çıxmaq lazım gəlirdi. Buna görə də hər ehtimala qarşı tədbir görmək lazım idi.* M.S.Ordubadi.

**EHTİMAM** *is.* [*ər.*] *köhn.* Səylə çalışma, səy göstərmə.

**EHTİRAQ** *is.* 1. Alışma, tutuşma.

2. Bir səyyarənin Günəşə yaxınlaşması, Günəşlə bir bürcdə olması.

**EHTİRAM** *is.* [*ər.*] Dərin hörmət, sayğı. *..Qasım əminin kənddə artıq ehtiramı vardı.* Ə.Haqverdiyev. *Kazım kişi bu ehtirama görə razılıq elədi və yenə fikrində durub dedi ki, öz işimdə qalmaq istəyirəm.* Mir Cəlal. *Ailədəki bu qarşılıqlı ehtiram indi artıq ənənə və etiqad halına gəlmişdi.* M.Hüseyn. ☐ **Ehtiram etmək (eləmək, göstərmək, qılmaq, saxlamaq)** – hörmət etmək, sayğı göstərmək. [Gülzar:] *Xudaya, ata-anaya ehtiram edib sevməyi övlada vacib etmisən.* S.S.Axundov. *Səlim ona əri Zeynaldan daha artıq ehtiram göstərmiş, izzəti-nəfsini müdafiə etmişdi.* S.Hüseyn. **Ehtiram sahibi** – hörmətli sayılan, hörmət edilən, nüfuzlu adam. *..Konsul kimi mütəşəxxis və ehtiram sahiblərindən ehtiyat etmək, hər halda, lazımdır.* C.Məmmədquluzadə. **Ehtirama layiq** – hörmət edilməli, hörmət edilməyə layiq. [Zeynal:] *Mehriban munis bir ana olmaq həsəbi ilə ehtirama layiq bir qadındır..* S.Hüseyn.

**EHTİRAMƏN** [*ər.*] *klas.* Ehtiramla, hörmətlə. *Ehtiramən səni hər gündə ziyarət edərəm.* M.Ə.Sabir.

**EHTİRAMLA** *zərf* Hörmətlə, hörmət və nəzakət qaydalarını gözləyərək. *Dilbər, ehtiramla, mərhəmət ilə; Yanıma gəldiyin yadıma düşdü.* Aşıq Dilqəm. *İçəri daxil olcaq Dəmirov .. ehtiramla başını əydi və salam verdi.* S.Rəhimov. ☐ **Kamali-ehtiramla** – hörmət və nəzakət qaydalarına riayət edərək, böyük hörmətlə. *Kamali-ehtiramla qarşılamaq. Kamali-ehtiramla müraciət etmək.*

**EHTİRAMLI** *sif.* 1. Hörmət göstərən, hörmətcil, mərifətli, nəzakətli, qanacaqlı. *Ehtiramlı adam.*

2. Hörmətli.

**EHTİRAMSIZ** *sif.* Hörmət və nəzakət qaydalarını gözləməyən, hörmət göstərməyən, nəzakətsiz, ədəbsiz, mərifətsiz.

**EHTİRAMSIZLIQ** *is.* Hörmətsizlik, mərifətsizlik, ədəbsizlik, nəzakətsizlik. *Ehtiramsızlıq etmək. Ehtiramsızlıq göstərmək.* – *Hər halda özgələrin rəy və təsvirinə qarşı bu ehtiramsızlığı mən heç vaxt özümə layiq bilməzdim...* Ü.Hacıbəyov.

**EHTİRAS** *is.* [*ər.*] 1. Ağlın çətinliklə idarə edə bildiyi hiss. *Ehtirasını saxlamaq.* – [Xəlifə:] *Səndə var coşqun ehtiras alovu; Yaxar atəşlərin sönük bir evi.* H.Cavid. *Sübhanverdizadə düşünür, getdikcə hərisliyi artır, gözlərində ehtiras qığılcımı çırtıldayırdı.* S.Rəhimov. *Yazıçı iki gəncin məhəbbətini də şüurlu və sadə bir məhəbbət kimi verir. Bu məhəbbət ehtirasa deyil, iki düşüncəli gəncin bir-birinə tam şüurlu münasibətinə əsaslanır.* M.Arif. // Coşqunluq, ruh yüksəkliyi, vəcd, həyəcan. *Bədii-ruhi təsir cəhətindən ..”Çargah” – həyəcan və ehtiras, “Bayatı-şiraz” – qəmginlik, “Humayun” isə “Şüştər”ə nisbətən daha dərin bir kədər hissi oyadır.* Ü.Hacıbəyov. [Südabənin] *qapqara gözləri yenə şam kimi yandı. Bir ehtiras alovu ilə işıqlandı.* M.İbrahimov.

2. Şiddətli arzu, eşq, həvəs, şövq, meyil. [Afət:] *Bədənim yandırır öz libasımı; Dəryalar söndürməz ehtirasımı.* M.Rahim.

3. Şəhvət, hərislik, düşkünlük, təəşşüq. [Şeyx Kəbir:] *Alçalır, ruhun alçalır... Ancaq; Səni alçaldan ehtiras olacaq.* H.Cavid. *..Mərcan bəy öz alçaq ehtiraslarını tərk edə bilmir, bəlkə həmin ehtiraslara azad imkanlar axtarır.* Ə.Sultanlı.

**EHTİRASLA** *zərf.* 1. Coşqunluqla, eşqlə, həyəcanla. *Şamxal ələ keçirdiyi ovu yırtıcı bir ehtirasla parçalamaq fikrində deyildi.* İ.Şıxlı.

2. Hərisliklə, qızğınlıqla. *Maya zərif qollarını açıb məhəbbət və ehtirasla Qaraşın boynuna sarıldı.* M.İbrahimov.

**EHTİRASLI** *sif.* 1. Coşqun, həyəcanlı. *Ehtiraslı nitq. Ehtiraslı mübahisə.* // Bir şeyin dəlicəsinə aludəsi, həvəskarı, vurğunu olan. *Ehtiraslı ovçu. Ehtiraslı oyunçu. Ehtiraslı futbol azarkeşləri.* – *Məmun ehtiraslı mütaliəçi idi. Çox oxuyurdu və gözlərini çox yorurdu.* Ə.Məmmədxanlı.

2. Ehtirasla dolu; ehtiras, eşq ifadə edən, həris, düşkün. *Ehtiraslı öpüş.* – *Xan ayaq saxlayıb ehtiraslı baxışla* [Tutubəyimi] *süzdü.* Çəmənzəminli.

**EHTİRASSIZ** *sif.* və *zərf* Həvəssiz, hərarətsiz, şövqsüz. *Ehtirassız adam. Ehtirassız danışmaq.*

**EHTİŞAM** *is.* [*ər.*] *tənt.* Gözqamaşdırıcı təmtəraq, dəbdəbə, cəlal, əzəmət. *Ey ehtişami-milləti talan olan çocuq! Ey dərbədər gəzib ürəyi qan olan çocuq!* M.Ə.Sabir. *Sönmədi ondakı əski ehtişam; Ürəklə girişdi yeni xidmətə.* M.Müşfiq.

**EHTİŞAMLA** *zərf* Ehtişamlı bir surətdə, əzəmətlə, möhtəşəm. *Qoca Qafqaz yaranandan yaşamışdır ehtişamla.* M.Rahim.

**EHTİŞAMLI** *sif.* Əzəmətli, dəbdəbəli, təntənəli, çox möhtəşəm. *Ehtişamlı saray. Ehtişamlı ziyafət.*

**EHTİVA** [*ər.*]: **ehtiva etmək** *kit.* – içinə almaq, daxilində olmaq, tərkibində yerləşmək, əhatə etmək, qavramaq. [Eyvaz:] *Bu, məhəbbətin elə böyük bir anı idi ki, insan öz diqqət və nəcibliyi ilə bütün dünyanı ehtiva etmək istəyir.* İ.Əfəndiyev.

**EHTİYAC** *is.* [*ər.*] 1. Hər hansı bir şeyə olan və onsuz keçinmək mümkün olmayan tələbat, gərəklik, lüzum. *Xassə, ol rus elminə talib; Onlara ehtiyacımız çoxdur; Bilməsək dil, ilacımız yoxdur.* S.Ə.Şirvani. *Poçt yolu ilə gəlib-gedənlərin hər ehtiyaclarını Rəhim bəy kəmali-məmnuniyyətlə rəf edirdi.* Ə.Haqverdiyev.

2. Yoxsulluq, kasıblıq. *Ehtiyac içərisində yaşamaq. Ehtiyac içində böyümək.* – *Bu əğniyaların üzün görüncə ehtiyacda; Get, ey fəqiri-binəva, kəfən bürün, məzarı gör!* M.Ə.Sabir. *Ehtiyac üzündən özgə qapısında qulluqçuluq edən qız görmədiyi, sevmədiyi dəli bir dövlətliyə satılır.* S.S.Axundov. *Şirəli də başqaları kimi yoxsulluq, ehtiyac içində böyümüşdü.* M.Hüseyn.

**EHTİYACSIZ** *zərf* Heç bir ehtiyac hiss etmədən, maddi cəhətdən heç bir çətinlik çəkmədən. *Ehtiyacsız yaşamaq.*

**EHTİYAT** *is.* [*ər.*] 1. Gələcəkdə lazım olacağı nəzərdə tutulub tədarük edilmiş,

saxlanmış şey; tədarük. *Ərzaq ehtiyatı. Taxıl ehtiyatı. Mal ehtiyatı.* – [Qoca] *..son qonaq ehtiyatı üçün saxladığı böyük şanı kəsib tabaqda buraya gətirmişdi.* S.Rəhimov. *..Kənddən çıxdıqlarının onuncu günü Səriyyə xala yemək ehtiyatının tükənməyə başladığını hiss etdi.* M.İbrahimov. ☐ **Ehtiyat görmək** – 1) hazırlıq aparmaq, tədarük görmək, hazırlaşmaq (bayram, qonaqlıq, toy və s. münasibəti ilə). *Bəli, Bəxtiyara xəbər yolladılar ki, filan gündə, filan saatda sənə qonağıq, ehtiyatını gör.* (Nağıl); 2) gələcək üçün yığmaq, toplamaq; tədarük etmək (mal, pul və s). *Uzun illər böyük bir etibara malik olan Nemətullayev, çox sakit həyat sürür və gələcək üçün ehtiyat görürdü.* S.Rəhimov.

2. Zərurət, ehtiyac hiss edildikdə istifadə edilən (şey). *Ehtiyat fondu. Ehtiyat qüvvələri. Toxunulmaz ehtiyat.* – *Radio səslənir: – Hüseyn, dön geri; Qalxmışdır ehtiyat təyyarələri.* M.Rahim. ☐ **Ehtiyat üçün** – gələcəkdə, sonradan gərəkli, lazım olacağı ehtimalı ilə, hər bir ehtimala qarşı. *Ehtiyat üçün pul götürmək. Ehtiyat üçün özü ilə adam götürmək.* – *Müəllim ehtiyat üçün məktəb xidmətçisi Mahmud əmini də götürdü.* B.Talıblı. [Kazım] *isə ehtiyat üçün götürdüyü kəndiri çıxarıb böyük çətinliklə Zeynəbin əllərini, ayaqlarını sarıdı.* İ.Şıxlı.

3. Hələlik istifadə edilməyən, lakin mövcud olan şeyin miqdarı (çox vaxt cəm şəklində işlənir). *Neft ehtiyatı. Dəmir ehtiyatı. Ölkəmizin tükənməz ehtiyatı. – Bir sıra alimlərin apardığı hesaba görə, Yer kürəsinin tərkibində olan tək uran və torinin atom energiyası neft və daş kömür ehtiyatının energiyasından 20 dəfə çoxdur.* A.Qarayev.

4. Müharibə vaxtı orduda xidmətə yarayan, hərbi uçotda olan vətəndaşlar. *Ehtiyata buraxmaq. Ehtiyatda olanları orduya çağırmaq. – Eldar bir ehtiyat komandiri kimi cəbhəyə getməli oldu.* İ.Əfəndiyev.

5. Təhlükəni nəzərə alaraq, tədbirli, üsullu hərəkət etmə, davranma. *Ehtiyat igidin yaraşığıdır.* (Ata. sözü). *İstədim həcv edim bir özgə sayaq; Amma yenə mane oldu ehtiyat.* Q.Zakir. [Bəxtiyar:] *Sarayda başqadır həyat; Bir az gərəkdir ehtiyat.* A.Şaiq. *Qınama qızları, bu ehtiyatdır; Dünyada tez qızan, tez də soyuyar.* S.Vurğun. // Qorxma, çəkinmə. ☐ **Ehtiyat etmək (eləmək)** – qorxmaq, çəkinmək, saqınmaq. *Soyuqdan ehtiyat etmək. İşin çətinliyindən ehtiyat etmək. – Sərsəri basma qədəm eşq təriqinə, Füzuli; Ehtiyat eylə ki, qayətdə xətərnak səfərdir.* Füzuli. [Qazı:] *Qızım, sən heç kəsdən ehtiyat etmə, heç kəsin cürəti yoxdur, sənə bir çırtma vursun.* Ə.Haqverdiyev. [Molla Xəlil] *müəllimin əleyhinə danışmaqdan, təbliğat aparmaqdan ehtiyat edirdi.* S.Hüseyn.

◊ **Ehtiyatı əldən buraxmaq** – hər bir ehtimala qarşı tədbir görmək. [Vəzir:] *Siz hər gün burada hazır olarsınız. Hər halda, ehtiyatı əldən buraxmaq olmaz.* Ü.Hacıbəyov.

**EHTİYATKAR** [*ər.* ehtiyat və *fars.* ...kar] b a x **ehtiyatlı**.

**EHTİYATKARANƏ** [*ər.* ehtiyat və *fars.* ...karanə] b a x **ehtiyatla**.

**EHTİYATKARLIQ** b a x **ehtiyatlılıq**.

**EHTİYATLA** *zərf* 1. Qorxa-qorxa, çəkinə-çəkinə, ehtiyat edərək, ehtiyat gözləyərək. *Ehtiyatla danışmaq. Ehtiyatla yerimək. – ..Çox möminlər var ki, Molla Nəsrəddini ehtiyatla bükür kağıza və bir cavan adam tapıb deyir ki, al bunu, oxu görək, molla nə yazır..* C.Məmmədquluzadə. *Hacı Qulu .. ehtiyatla quyunun yanında uzanıb diqqətlə baxdı.* A.Şaiq.

2. Yavaş, asta, səs salmadan, üsullu(ca), yavaşca. [Molla Xəlil] *çox ehtiyatla müəllimin qapısına gəldi.* S.Hüseyn. [Qaraş] *Mayanı şirin səhər yuxusundan ayıltmaq istəməyərək ehtiyatla geyinib çölə çıxdı.* M.İbrahimov. *Tahirzadə çustlarını geyib kimsəni oyatmamaq üçün ehtiyatla evdə gəzdi.* Mir Cəlal.

**EHTİYATLANMA** "Ehtiyatlanmaq"dan *f.is.*

**EHTİYATLANMAQ** *f.* Ehtiyat etmək, qorxmaq, çəkinmək, ürək eləməmək. [Dərviş:] *..Baxdım gördüm, qoca kişi məndən ehtiyatlanıbdır.* A.Divanbəyoğlu. *Mən, doğrusu, ehtiyatlanmağa başladım.* Qantəmir. [Məmmədhüseyn] *Cəmilin hökumət pansionuna keçməsi münasibəti ilə öz adının "dəftərə düşməsindən" ehtiyatlanırdı.* Mir Cəlal.

**EHTİYATLI** *sif.* 1. Öz hərəkətlərində, işində ehtiyat gözləyən, meydana çıxa biləcək hər bir ehtimala qarşı lazımi tədbir görən. – *Məmməd .. ehtiyatlı adam idi.* M.İbrahimov. // *zərf* Ehmallı, üsullu, ehtiyatla. *Çıxdım küçəyə və ehtiyatlı keçib getdim.* C.Məmmədquluzadə. *Qoy bizə gülməsin nə dost, nə də yad; Ehtiyatlı danış, ehtiyatlı dur!* S.Vurğun. ◻ **Ehtiyatlı olmaq** – gözlənilən hər bir ehtimala qarşı tədbirli olmaq, üsullu iş görmək, qorxulu bir iş üçün hazır olmaq. *Zaman ani olaraq qərara gəldi ki, ehtiyatlı olmaq lazımdır.* S.Rəhimov. *Axşam ovunda ehtiyatlı olmağı qərara aldım.* M.Rzaquluzadə.

2. Tədarüklü, gələcək üçün ehtiyat saxlayan, tədarük edib saxlayan. *Ehtiyatlı qadın. Ehtiyatlı ev.*

**EHTİYATLILIQ** *is.* Üsulluluq, tədbirlilik, ehtiyat etmə, çəkinmə. *Bir başqası isə ehtiyatlılıq edirdi..* Ə.Əbülhəsən.

**EHTİYATSIZ** *sif.* 1. Ehtiyat gözləməyən, işin dal-qabağını gözləməyən, qabaqcadan tədbir görməyən, tədbirsiz, üsulsuz. *Ehtiyatsız adam. – Bəzən ehtiyatsız, kiçik bir xata; Böyük faciələr yaradır, demək!* S.Vurğun. *..Gurşad yağmur ehtiyatsız yolçuları islanmış cücəyə döndərir.* M.Rzaquluzadə. // Zərf mənasında. *Ehtiyatsız iş görmək. Ehtiyatsız davranmaq.*

2. Heç bir ehtiyatı, tədarükü olmayan. *Ehtiyatsız ev. Ehtiyatsız adam. – Buradır yoxluğa gedən yol, bəli; Ehtiyatsız atma qədəm irəli!* Şəhriyar.

**EHTİYATSIZLIQ** *is.* 1. Ehtiyat gözləməmə, qarşıya çıxa biləcək təhlükəni və s.-ni qabaqcadan nəzərə alıb heç bir tədbir görməmə, üsulsuzluq. *Ehtiyatsızlıq etmək. – Gəldiyev .. taxıl tədarükü müvəkkilliyində çalışanda da xamlıq ucundan, ya ehtiyatsızlıqdan, ya da ayrı səbəbdən bir balaca dolaşan kimi olmuşdu.* Mir Cəlal. [Gülsənəm] *ehtiyatsızlıq eləyib, Tahirin məktubunu gözaltı elədiyi qıza oxutmuşdu.* M.Hüseyn. *Ax, bu ehtiyatsızlıq, düşməni saymamaq, onun hiylələrini və bicliklərini hesaba almamaq komandirin ən böyük nöqsanıdır.* Ə.Vəliyev.

2. Ehtiyatsız hərəkət. *Ehtiyatsızlığa yol vermək. – İlan insanları ehtiyatsızlığa sövq etmək üçün özünü aciz göstərir.* M.S.Ordubadi.

**EHTİYATSIZLIQLA** *zərf* Heç bir ehtiyat gözləmədən, ehtiyatsız. *Mahmud .. ehtiyatsızlıqla soruşdu.* Ə.Əbülhəsən.

**EHTİZAZ** *is.* [*ər.*] *kit.* 1. Xəfif surətdə titrəmə, titrəyiş. *Çatdıqca incə ruhuma, aldıqca hər nəfəs; Sarsın bütün vücudumu sönməz bir ehtizaz.* A.Şaiq. *Nədən şəfəqli buludcuqlar öylə çöhrəndə; Bir ehtizaz ilə nəşr eyləməkdə şəbnəmlər?* H.Cavid. ◻ **Ehtizaza gətirmək** – 1) titrətmək; 2) *məc.* dilləndirmək. *Tahir daha da cuşa gəlib sazın tellərini lap ürəkdən ehtizaza gətirirdi.* M.Hüseyn.

2. Fizikada: cismin titrəyişli hərəkəti, titrəməsi, titrəyişi.

**EHYA** [*ər.*] *klas.* Vücuda gətirmə, canlandırma, bərpaetmə. ◻ **Ehya etmək (qılmaq)** – canlandırmaq, bərpa etmək, vücuda gətirmək. *Ehya qılur əgərçi dəmin, ey sənəm; Xəlvət nişinə şahidü şəmü şəkər gərək.* Nəsimi. *O, Səfəvilər dövrünün, Şeyx Səfinin səltənətinin nüfuz və ehtiramını ehya etmək istəyir.* Ə.Haqverdiyev. *Bir də Zeybək qızını xatırladı, zehnində onun məhzun baxışını ehya etdi.* Çəmənzəminli.

**EHYANA** *zərf dan.* İşdi, bəlkə, ola bilsin. *Ehyana gələ bilmədim. Ehyana bu iş baş tutmadı.* – [Cahangir bəy:] *..Ehyana həmin bu yerdə düşmənə rast gəldik, onda nə etməli?* N.Vəzirov.

**EXİNOKOKKÓZ** [*yun.* echino – kirpi və coccus] *tib. zool.* İtin və bəzi başqa heyvanların bağırsaqlarında yaşayan lentşəkilli tüfeyli qurd. // İnsanın və heyvanın bəzi üzvlərində yaşayıb ağır xəstəliklər törədən bu qurdun sürfələri.

**EKİZ** *sif.* Bir anadan bir vaxtda doğulmuş. *Ekiz qardaşlar. Ekiz bacılar. – O gün professor Aslanov deyirdi ki, sizə baxan elə bilir ki, ekiz bacısınız, heç ana-balaya oxşamırsınız.* M.İbrahimov. // *is.* Bir anadan bir vaxtda doğulmuş uşaqlardan hər biri; ekiztay. *Ekizlərin ikisi də qızdır.*

**EKİZTAY(I)** Ekiz. *Ekiztay oğlanlar. Ekiztay qızlar. – Onlar böyüyüb bir az caydaqlaşanda qonşudakı Zöhrə arvadın bir cüt ekiztay qızı oldu.* S.Rəhimov.

**EKİPÁJ**[1] [*fr.*] Yaylı minik arabalarının (məs.: fayton, karet və s.-nin) ümumi adı; minik. *Birdən Vasili İvanoviçin qulağına yaylı bir ekipaj taqqıltısı – ucqar kəndlərdə xüsusilə seçilən haman taqqıltı gəldi.* Turgenevdən.

**EKİPÁJ**[2] [*fr.*] 1. Gəminin, təyyarənin, tankın və s.-nin şəxsi heyəti; komandası. *Tapşırılmış işi layiqincə yerinə yetirmiş ekipaj Bakıya sevinclə qayıdırdı.* (Qəzetlərdən).

2. *hərb. dəniz.* Dəniz piyadasının sahil qoşunu.

**ÉKKER** [*fr.*] Yerdə müəyyən dərəcəli bucaqlar qurmaq üçün geodeziya aləti; künyə.

**EKLÉKTİK** *is.* [*yun.*] *kit.* Eklektizmə meyil edən, eklektizm mövqeyində duran adam.

**EKLEKTÍK** *sif.* [*yun.*] Eklektizmdən ibarət olan, eklektizm mahiyyətində olan. *Eklektik nəzəriyyə. Əsər eklektik xarakter daşıyır.*

**EKLÉKTİKA** *kit.* b a x **eklektizm**.

**EKLEKTİKLİK** *is.* Eklektik mahiyyətdə olma. *Nəticələrin eklektikliyi.*

**EKLEKTİSÍZM** b a x **eklektizm**.

**EKLEKTÍZM** [*yun.*] *kit.* Bir-birinə zidd olan fikir və nəzəriyyələrin prinsipsiz və mexaniki surətdə birləşdirilməsi.

**EKLÍPTİKA** [*yun.*] *astr.* Göy sferinin, Günəşin xəyali illik hərəkətinin cərəyan etdiyi böyük dairəsi.

**EKOLÓGİYA** [*yun.* oikos – ev və logos – elm, anlayış] Biologiyanın, heyvan və bitki orqanizmlərinin mühitlə qarşılıqlı münasibətindən bəhs edən şöbəsi. *Şərti reflekslərin ekologiyasını öyrənmək üçün müşahidələr təbii şəraitə yaxın olan bir mühitdə aparılmalıdır.* A.Qarayev.

**EKOLOJİ** *sif.* [*yun.*] Ekologiyaya aid, ekologiyaya məxsus. *Ayrı-ayrı rayonlarda bəzi ekoloji amillər bitkiyə təsir edərək, onun bu rayonlarda becərilməsi və normal inkişaf etməsini təmin edir.* İ.Axundzadə.

**EKONOMÍST** [*yun.*] 1. İqtisadçı.

2. *tar.* Ekonomizm tərəfdarı.

**EKONOMÍZM** [*yun.*] *tar.* XIX əsrin axırlarında və XX əsrin əvvəllərində rus sosial-demokratları arasında meydana gəlmiş opportunist cərəyan (bu cərəyan tərəfdarlarının fikrinə görə, fəhlə sinfi yalnız öz iqtisadi vəziyyətini yaxşılaşdırmaq üçün mübarizə apararaq mütləqiyyətlə siyasi mübarizəni burjuaziyaya buraxmalı idi).

**EKRÁN** [*fr.*] 1. Üzərində kino, yaxud diapozitiv şəkilləri göstərilən ağ səth (məs.: pərdə və s). *Mirzə gözlərini televizorun ekranına zilləsə də, orda heç nə görmürdü, elə hey başını yelləyirdi.* İ.Məlikzadə.

2. *məc.* Kino sənəti, kino. *Ekran üçün yaxşı boy və görkəm birinci şərtdir.*

3. Müxtəlif enerji şüalarından qorunmaq və ya ondan istifadə etmək üçün səthli qurğu. *Radio aparatları ekranı.*

4. *tex.* İstidən və ya işıqdan qorunmaq üçün mütəhərrik sipər.

**EKRANLAMA** "Ekranlamaq"dan *f.is.*

**EKRANLAMAQ** *f. tex.* Xarici, zərərli təsirdən və s.-dən qorumaq üçün qabağına ekran, sipər və s. çəkmək; pərdələmək.

**EKRANLANMA** *tex.* "Ekranlanmaq"dan *f.is.* Bir şeyi xarici, zərərli təsirlərdən və s.-dən qoruma tədbirləri.

**EKRANLANMAQ** *məch. tex.* Qabağına ekran çəkilmək.

**EKRANLANMIŞ** *f.sif. tex.* Qabağına ekran çəkilmiş, ekranla sipərlənmiş.

**EKRANLAŞDIRILMA** "Ekranlaşdırılmaq"dan *f.is. Romanın ekranlaşdırılması.*

**EKRANLAŞDIRILMAQ** *məch.* Kino şəkli halına salınmaq, kinoda göstərilmək üçün uyğunlaşdırılmaq.

**EKRANLAŞDIRILMIŞ** *f.sif.* Kino şəkli halına salınmış, kinoda göstərilmək üçün uyğunlaşdırılmış.

**EKRANLAŞDIRMA** "Ekranlaşdırmaq"-dan *f.is. Romanı ekranlaşdırma.*

**EKRANLAŞDIRMAQ** *f.* Xüsusi olaraq kino üçün yazılmamış pyesi və ya başqa bədii bir əsəri kinoda, ekranda göstərmək üçün uyğunlaşdırmaq.

**EKRANLI** *sif. tex.* 1. Ekranı olan, ekran qoyulmuş. *Ekranlı qurğu.*

2. Xarici təsirdən qoruyucusu olan. *Ekranlı kabel. Ekranlı elektrik lampası.*

**EKSKAVÁTOR** [*lat.*] *tex.* Yerqazıyan, torpağı, daşı və s.-ni götürüb başqa yerə tökən maşın. *Addımlayan ekskavator. Tırtıllı ekskavator. – O daşlı, qumsallı, gilli torpağı; Udur, lay-lay udur ekskavatorlar.* S.Vurğun. *Fər-*

*man nəşə və həvəslə öz ekskavatorunda işləyirdi.* Ə.Sadıq.

**EKSKAVATORÇU** *is.* Ekskavatorda işləyən fəhlə. *Yarışır kanal çəkən ekskavatorçular.* Ə.Cəmil.

**EKSKAVATORÇULUQ** *is.* Ekskavatorçu sənəti, peşəsi. *Fərmana ekskavatorçuluğu Zuyev öyrətmişdi.* Ə.Sadıq.

**EKSKLÜZİV** [*yun.*] Məxsusi müsahibə, xüsusi intervyu. *Eksklüziv müsahibə.*

**EKSKÚRS** [*lat.*] *kit.* Köməkçi məsələni aydınlaşdırmaq üçün əsas mövzudan haşiyə çıxma.

**EKSKURSÁNT** [*lat.*] b a x **ekskursiyaçı**.

**EKSKÚRSİYA** *is.* [*lat.*] Elmi və ya öz məlumatını artırmaq, yaxud da əyləncə məqsədi ilə təşkil edilən (kollektiv) səyahət. *Səlim darülfünunun tibb şöbəsinin son kurs tələbələri ilə .. ekskursiyaya getməli oldu.* S.Hüseyn. *Yunis boylananda Almazın uşaqları haraya isə ekskursiyaya apardığını gördü.* Mir Cəlal.

**EKSKURSİYAÇI** *is.* Ekskursiya iştirakçısı.

**EKSPÁNSİYA** *is.* [*lat.*] Təsir dairəsini genişləndirmə.

**EKSPEDÍSİYA** [*lat.*] 1. *xüs.* Yük və s. şeyləri bir yerdən başqa yerlərə yollamaq üçün müəssisə və ya onun bir şöbəsi; göndərici müəssisə. *Poçtamtın qəzet ekspedisiyası. Ekspedisiya kontoru.*

2. Müəyyən məqsəd üçün qrup halında edilən səyahət, səfər. *Elmi ekspedisiya. Şimal qütbünə ekspedisiya. – Kinostudiya .. ekspedisiyaya hazırlaşırdı.* İ.Əfəndiyev.

3. Bu cür səfər, səyahət və ya yürüş iştirakçıları heyəti, dəstəsi.

**EKSPEDÍTOR** [*lat.*] Mal və s. göndərməklə məşğul olan işçi. *Poçt ekspeditoru. Ticarət bazası ekspeditoru.*

**EKSPEDİTORLUQ** *is.* Ekspeditorun işi, vəzifəsi. *Ekspeditorluq etmək.*

**EKSPERİMÉNT** [*lat.*] Elmi təcrübə. *Eksperiment aparmaq.* // Ümumiyyətlə, təcrübə, sınaq. [Şeyda:] *Yazgül, xahiş edirəm, bizim çağanın üstündə cürbəcür eksperiment aparmayasan!* Ə.Məmmədxanlı.

**EKSPERİMENTÁL** *sif.* [*lat.*] 1. Təcrübi. *Eksperimental tədqiqat üsulu.* // Təcrübə üçün ayrılmış (təyin edilmiş). *Eksperimental zavod. Eksperimental şöbə.*

2. Eksperiment (elmi təcrübə) üzərində əsaslanan. *Eksperimental fizika. Eksperimental fonetika. – Eksperimental anatomiya – bədənin quruluşunu diri vücud, başlıca olaraq diri heyvan üzərində öyrənir və eksperimental metoddan istifadə edir.* K.Balakişiyev.

**EKSPERİMENTÁTOR** [*lat.*] b a x **eksperimentçi**.

**EKSPERİMENTÇİ** *is.* Eksperiment (elmi təcrübə) aparan mütəxəssis.

**EKSPÉRT** [*lat.*] 1. 1. Mübahisəli məsələlərin həlli üçün dəvət edilən mütəxəssis və ya mütəxəssislər qrupu.

2. Yoxlayıcı, müzakirəedici komissiya. *Ali Attestasiya Komissiyasının ekspertləri.*

**EKSPERTÍZA** [*lat.*] 1. Düzgün qərara gəlmək üçün hər hansı bir məsələnin mütəxəssislər tərəfindən öyrənilməsi, yoxlanması. *Elmi ekspertiza. Materialları ekspertizaya göndərmək.*

2. Ekspert komissiyası. *Ekspertiza üzvü. Ekspertiza ayırmaq. Ekspertizanın qərarı.*

**EKSPONÁT** [*lat.*] Sərgidə, muzeydə nümayiş etdirilən məmulat. *Muzey eksponatları. – Ülfət Yunis və Davud ilə birlikdə gerbi maşından çıxarıb akademiyaya, bayramsayağı bəzənmiş binaya gətirəndə eksponatlar qəbulu bitmişdi.* Mir Cəlal.

**EKSPOZÍSİYA** [*lat.*] 1. Müxtəlif şeylərin, materialların və s.-nin müəyyən qayda üzrə yerləşdirilməsi, düzülüşü, qoyuluşu. *Sərginin düzgün ekspozisiyası.* // Tamaşa edilmək üçün müəyyən qaydada, müəyyən sistemdə düzülmüş, yerləşdirilmiş, qoyulmuş şeylərin özü. *Muzey ekspozisiyası. Sərgi ekspozisiyası.*

2. Ədəbi əsərlərdə: əsas süjetin inkişafından qabaq olmuş keyfiyyətləri, hadisələri izah edən giriş hissə. *Tragediyanın ekspozisiyası.* // Musiqi əsərinin, əsas mövzuların ifadəsindən ibarət olan birinci hissəsi. *Ekspozisiyada, çalınmış temalar arasındakı kontrast, sonata formasının məhz inkişaf bölməsində daha qabarıq bir şəkildə aşkara çıxarılır.* Ə.Bədəlbəyli.

3. *fot.* Şəkil çəkərkən fotoaparat obyektivinin açıq qalmalı olduğu müddət. □ **Ekspozisiya vermək** – fotoplyonkasını müəyyən vaxt işıq təsiri altında saxlamaq.

**EKSPRÉSS** *is.* [*ing.*] Böyük məsafələri adətən heç bir yerdə dayanmadan qət edən sürətli nəqliyyat vasitəsi (qatar, gəmi, avtobus və s.) *Bakı ilə Gəncə arasında ekspress işləyir.*

**EKSPRESSİONÍST** [*fr.*] Ekspressionizm tərəfdarı.

**EKSPRESSİONÍZM** [*fr.*] Burjua incəsənəti və ədəbiyyatında XX əsrin birinci yarısında meydana gəlmiş cərəyan (bu cərəyan tərəfdarları, sənətkarın öz daxili aləmini, onun subyektiv yaradıcılıq təəssüratını ifadə etməyi əsas vəzifə hesab edirdilər).

**EKSPRESSÍV** *sif.* [*lat.*] *kit.* Mənalı, təsirli, ifadəli. *Ekspressiv söz.*

**EKSPRESSİVLİK** *is. kit.* Mənalılıq, təsirlilik, ifadəlilik. *Nitqin ekspressivliyi.*

**EKSPRÓMT** [*lat.*] 1. Hazırlaşmadan sinədən söylənilən nitq, şeir, yaxud çalınan musiqi əsəri və s.; bədahətən.

2. *mus.* Sərbəst formada yazılmış kiçik musiqi əsəri. *Raxmaninovun ekspromtu.*

**EKSPROPRİÁSİYA** [*fr.*] Bir sinif və ya ictimai qrup tərəfindən başqa bir sinif və ya ictimai qrupun öz mülkiyyətindən və əvvəlki ictimai vəziyyətindən məhrum edilməsi. *Ekspropriatorların ekspropriasiyası* (proletar inqilabı dövründə burjuaziyanın bütün istehsal vasitələrindən məhrum edilməsi).

**EKSPROPRİÁTOR** [*fr.*] Ekspropriasiya edən.

**EKSSENTRÍK**[1] *sif.* [*fr.*] *teatr.* 1. Kəskin səs, zidd görüşlər, qeyri-adi və çox gülməli üsullar əsasında olan. *Ekssentrik tamaşa. Ekssentrik nömrə.*

2. Çox qəribə, qeyri-adi. *Ekssentrik kostyum. Ekssentrik adam.*

**EKSSENTRÍK**[2] [*fr.*] *riyaz.* Ümumi mərkəzi olmayan. *Ekssentrik fiqur. Ekssentrik dairələr.*

**EKSSÉNTRİK**[3] [*fr.*] *teatr.* Ekssentrik rollar ifadə edən artist. *İstedadlı ekssentrik.*

**EKSSÉNTRİK**[4] [*fr.*] *tex.* Fırlanma oxu mərkəzdə deyil, böyürdə olan disk.

**EKSTAZ** *sif.* [*yun.*] 1. Ovqatın yüksək səviyyəsi.

2. Heyrət.

**EKSTENSÍV** *sif.* [*lat.*] *kit.* Keyfiyyətcə deyil, ancaq kəmiyyətcə (miqdarca) artan, genişlənən. *Ekstensiv əkinçilik.*

**EKSTENSİVLİK** *is. kit.* Keyfiyyətcə deyil, ancaq kəmiyyətcə artma, genişlənmə. *Təsərrüfatın ekstensivliyi.*

**EKSTÉRN** [*lat.*] Müvafiq məktəbdə oxumadan kənarda hazırlaşaraq, həmin məktəb kursunun imtahanlarını verən adam.

**EKSTERNÁT** [*lat.*] Məktəb proqramı kursunu ekstern yolu ilə keçərək imtahan vermə üsulu.

**EKSTERRİTORİÁL** *sif.* [*lat.* ex – xaric və territorialis – ərazidə olan] *hüq.* Eksterritoriallıq hüququndan istifadə edən; toxunulmaz. *Eksterritorial diplomatik işçi.*

**EKSTERRİTORİALLIQ** *hüq.* Bir ölkədə olan bəzi diplomatik nümayəndələrin yerli qanunlara deyil, ancaq öz dövlətlərinin qanunlarına tabe olmaq hüququ; toxunulmazlıq hüququ.

**EKSTERYÉR** [*fr.* əsli *lat.*] Heyvanların bədən quruluşunun xarici görünüşü.

**EKSTRA** *sif.* [*lat.*] Ən yaxşı, ən yüksək.

**EKSTREMÍST** [*lat.*] *kit.* Siyasətdə ifrat tədbirlər tərəfdarı. *Bir sıra yerlərdə barrikadalar qurmuş ekstremistlər ilə .. polislər arasında atışma hələ də davam edir.* (Qəzetlərdən).

**EKSTREMÍZM** [*lat.*] *kit.* Siyasətdə ifrat görüş və tədbirlərə meyil; ifratçılıq.

**EKVÁTOR** [*lat.*] *coğr.* Yer kürəsini mərkəzdən müstəvi ilə kəsən xətt. *Ekvator Yer kürəsini yarımkürəyə: şimal və cənub yarımkürələrinə bölür.*

**EKVATORİÁL** *sif.* [*lat.*] Ekvatora aid olan, ekvatorda olan, ekvatora yaxın, ekvator rayonlarına xas olan. *Ekvatorial axınlar. Ekvatorial koordinatlar.*

**EKVİVALÉNT** [*lat.*] 1. *is. iqt.* Başqa bir əmtəənin dəyərini təmsil edən əmtəə. *..Müəyyən bir əmtəənin ekvivalent forması onun başqa əmtəəyə bilavasitə mübadilə edilə bilməsi formasıdır.* K.Marks ("Kapital", tərcümə).

2. *sif.* Eyniqiymətli, bərabərqüvvəli. *Müasir elmdəki mülahizələr göstərir ki, cisimlərin inersiya kütləsi ilə ağırlıq kütləsi ekvivalentdir.* Z.Xəlilov.

**EKVİVALENTLİK** *is.* Bərabərlik, eyni qiymətdə, eyni qüvvədə, eyni mənada olma.

**EKZÉMA** [*yun.*] *tib.* İrinli səpkilər, suluqlar şəklində təzahür edən dəri xəstəliyi.

**EKZEMALI** *sif.* Ekzeması olan. *Ekzemalı xəstə. Ekzemalı ayaq. – Mollayev .. birdən ekzemalı barmaqları ilə* [Lalənin] *qolundan yapışdı..* M.Hüseyn.

**EKZOQÁMİYA** [*yun.* exo – xaric və gamos – evlənmə] *etnoqr.* Öz tayfasından, öz qohum-əqrəbasından, öz ictimai qrupundan evlənməyi qadağan edən adət.

**EKZOTERMÍK** *sif.* [*yun.* exo – xaric və thermos – isti] *kim.* İstilik çıxması ilə bağlı olan, istilik verən. *Ekzotermik proses.*

**EKZOTÍK** *sif.* [*yun.*] 1. Avropa ölkələri üçün qeyri-adi olan, onlara xas olmayan. *Ekzotik ölkələr* (avropalılar üçün qeyri-adi olan mədəniyyətə, təbiətə və s.-yə malik ölkələr; məs.: tropik ölkələr).

2. *məc.* Ümumiyyətlə, qeyri-adi, qəribə, yad. *Ekzotik musiqi. Ekzotik paltar.*

**EKZÓTİKA** [*yun.*] Avropalılar üçün qeyri-adi görünən hər şey (təbiət, məişət, adət, mədəniyyət və s). *Şərq ekzotikası. – Qazma sahibinin ekzotikaya olan meyli o dərəcəyə yetişmişdi ki, bir metr uzunluğunda, yarım metr enində olan qapıya da təzə bir cecim asdırmışdı.* Ə.Əbülhəsən. // Ümumiyyətlə, qəribə, qeyri-adi şey. *Gələr canlı ekzotika ağaların xoşuna; Əhsən deyər, radiolar xitab edər qoşuna.* S.Rüstəm.

**EQOÍST** *sif.* [*fr.* əsli *lat.*] Özünü bəyənən, özünü yüksək tutan, ancaq özünü, öz mənafeyini düşünən adam; xudbin. [Süleyman:] *Mən hələ ömrümdə bunun kimi eqoist adam görməmişəm.* M.İbrahimov.

**EQOİSTLİK** *is.* Eqoist adamın xassəsi, ancaq özünü, öz mənafeyini düşünmə; xudbinlik.

**EQOÍZM** [*fr.* əsli *lat.*] b a x **eqoistlik**.

**EL**[1] *is.* 1. Camaat, xalq, adamlar. *El üçün ağlayan gözsüz qalar.* (Ata. sözü). *Bahar fəsli el şad olur sərasər; Hərgiz məndən özgə yoxdur mükəddər.* Q.Zakir. *Fələyin cəbrindən, el tənəsindən; Dərdim artıb bir ümmana dönübdür.* Aşıq Ələsgər. *Bildir bu zaman idi. El məscidə yığılmışdı.* Mir Cəlal. □ **El anası, el atası** – elin başçısı, hamının qayğısını çəkən, dərdinə şərik olan, işinə yarayan, xeyir-şərində iştirak edən adam. [Mirzə Heydər:] *A başına dönüm, axır mənim təqsirim nədir? Mən deyəndə bir el anasıyam, sən çağırırsan, sənin işini görürəm, bu çağırır, gəlib onun işini görürəm.* Ə.Haqverdiyev. *Həsən hamının dadına çatır, hamının xeyrini-şərini görür. Həsən el atasıdır.* S.Rəhman. **El ədəbiyyatı** – şifahi xalq ədəbiyyatı, folklor. *Bu sarsıntılıq, bu qatışıqlıq el ədəbiyyatında gözəl parçalar yaratmış olsa da, yazı ədəbiyyatında bir qədər boşluq vücuda gətirmişdi.* C.Cabbarlı. *Yazılı klassik ədəbiyyatla bərabər, Azərbaycan dilində zəngin el ədəbiyyatı yaranır.* M.İbrahimov. **El oğlu, el qızı** – bir eldən olan, həmvətən, həmyerli (bəzən müraciət məqamında işlənir). *El oğlum, yadımdadır o dəmlər indikitək; Bağdakı uşaqlara, bir söz, ürəkdin, ürək.* S.Rüstəm. *Gözümün önündə canlanır hər an; Yolların yorğunu o qəmgin qarı; Bir də el oğlumun qərib məzarı.* M.Rahim. [Sevinc:] *Sən səhv edirsən, Mahmud! Mən bu gün sənin üçün bir el qızı yox, bir məktəb yoldaşıyam.* Z.Xəlil. **El yardım komitəsi** – 1917-ci il inqilabının ilk illərində ayrı-ayrı kəndlərdə, qəzalarda yoxsul kəndlilərə kömək etmək məqsədi ilə təşkil edilən komitə. *Bir tərəfdən, özünün yorulmaq bilmədən çalışması, digər tərəfdən, el yardım komitəsinin və başqa kənd təşkilatlarının maddi və mənəvi yardımı ilə Bəxtiyar özünə kəndin kənarında bir evcik düzəltmişdi.* S.Hüseyn. **El yolu** – işlək, böyük yol, gediş-gəliş çox olan yol. *El yolunun altında maşın dayandı.* Ə.Vəliyev.

2. Ölkə, məmləkət, vilayət. *Sağ gedəsən ulusuna, elinə*; *Misri qılınc bağladaram belinə.* "Koroğlu". *Molla Vəli Vidadi* və *Molla Pənah Vaqif hər ikisi bir əsrin və bir elin adamlarıdır.* F.Köçərli. [Səlim:] *Gəzdim, dolaşdım, uğradım hər elə; Mən böylə bir qadın görmədim hələ.* H.Cavid. □ **Eldən-elə** – bir eldən o biri elə, elbəel. *Eldən-elə gəzmək.* – [Qərib:] *Bir söz ilə eldən-elə atıldım; Bu qərib ellərdə yaxdı nar məni.* "Aşıq Qərib".

3. Tayfa, qəbilə. *Mən də ata və ana tərəfindən Müqəddəm elindənəm.* M.F.Axundzadə. *Deyirlər ki, qədim zamanlarda bu torpaqda bir el yaşarmış.* M.İbrahimov.

◊ **Elin dilinə salmaq (düşmək)** – dillərə salmaq.

**EL²** "L" hərfinin adı.

**ELAM** *is.* [*ər.*] *klas.* Bildirmə, anlatma, xəbərdar etmə. *Elam etmək. Elam qılmaq.* – *Bəhərhal, hər nə ki muradınızdır, mənə elam edin!* "Mehri-mah". [Şah Abbas:] *Sonra üzün hərəmlərə tutub xitab elədi: ..Mən kəmali-əfsus ilə məcburəm ki, bir yaman xəbəri sizə elam edəm.* M.F.Axundzadə. *Seyyid, ol mah sənin qətlinə iqdam etdi; Gedib öz çarəni qıl, eylədi elam sənə.* S.Ə.Şirvani.

**ELAMNAMƏ** *is.* [*ər.* elam və *fars.* namə] *klas.* Elam yazılmış rəsmi vərəqə, bildiriş vərəqəsi. *Mötəbər üləma vilayətlərə elamnamələr göndərirdi ki, bundan sonra bir kimsənə cürət etməsin ki, şaha və ümənayi-dövlətə .. peşkəş versin.* M.F.Axundzadə.

**ELAN** *is.* [*ər.*] 1. Yazılı, çap olunmuş bildiriş, xəbər, məlumat. *Qəzet elanı. Divara elan vurmaq. Dərslərin başlanması haqqında elan.* – *Üç gün qabaqdan divarlara böyük, rəngli elanlar vurulmuşdu.* Mir Cəlal. □ **Elan etmək** – 1) hamının eşidəcəyi tərzdə xəbər vermək, məlumat vermək, bildirmək. *İclası açıq elan etmək. Müharibə elan etmək* (müharibə başladığını bildirmək). – *Ruhanilər vahid bir cəbhə tutaraq Axundov komediyalarına qarşı cahad elan etdilər.* Ə.Haqverdiyev. // Mətbuat vasitəsilə bildirmək. *İanə verənləri mətbuat səhifələrində adbaad elan etmək çətin idi.* Mir Cəlal; 2) açmaq, izhar etmək, bildirmək. *İndi daha gəlib çatmış o zaman; Sənə bir gizli sirr edim mən elan.* A.Səhhət. **Elan vermək** – 1) məlumat vermək, xəbərdar etmək, bildirmək. *Gəldiyev elan verib, sabaha büro iclası çağırdı.* Mir Cəlal; 2) qəzet və ya mətbuat vasitəsilə bildirmək, xəbər vermək. *Müşavirə haqqında qəzetdə elan vermək.* **Elani-eşq (elani-məhəbbət) etmək** – eşq və məhəbbətini bildirmək, sevgisini elan etmək. [Məhəmmədcəfər] *qadınlar məclisində qadın azadlığı haqqında məruzədə elani-eşq edən dərəcədə ləzzətli danışırdı.* Qantəmir.

2. *köhn.* Rəsmi bildiriş vərəqəsi. *Məlumdur ki, xəzinədən gələn vergi elanının müqabilində danışıq olmaz.* Ə.Haqverdiyev.

**ELASTİK** *sif.* [*yun.*] Sıxılıb buraxıldıqda əvvəlki şəklini alan, möhkəm, lakin sıxıldıqda yığıla bilən. *Elastik rezin. Elastik yay. Elastik parça. Elastik əzələlər.*

**ELASTİKİ** b a x **elastik**. *Elastiki cisimlər.*

**ELASTİKİYYƏT** *köhn.* b a x **elastiklik**. *Müəyyən sabit mərkəzə cəzb edən və o mərkəzdən məsafə ilə düz proporsional dəyişən qüvvəyə çox təsadüf edilir. Belə qüvvəyə elastikiyyət qüvvəsi misal ola bilər.* Z.Xəlil.

**ELASTİKLİK** *is.* Elastik şeyin hal və keyfiyyəti. *Bir elementin müxtəlif izotopları bir-birindən bir çox fiziki xassələri, xüsusən çəkisi, elastikliyi və ərimə temperaturuna görə cüzi də olsa fərqlənir.* A.Qarayev.

**ELAT** *top. köhn.* Bir yurdda, bir yerdə yaşayan camaat, xalq, el. *..Qazax mahalının vəkili Pənah ağanın zamanında bir para şuriş və inqilabın vüquinə görə Qazax mahalından bir neçə elat köçüb Qarabağ vilayətinə, İbrahim xanın təhti-himayəsinə keçibdir.* F.Köçərli. // Başlıca olaraq maldarlıqla məşğul olan köçəri kənd əhalisi. *Yaz ayı elat dağa çıxanda Nəbi dəstəsiynən gəlmişdi Qırxlar dağına.* "Qaçaq Nəbi". [Şəhrəbanu xanım:] *..Müsyö Jordana qaymaq gərək, yağ gərək, axşama plov gərək, bozartma gərək ki, gedib öz ölkəsində deməsin ki, Qarabağ elatının arvadları mərifətsiz olurlar.* M.F.Axundzadə. *Bir dəfə* [Hacı Rüstəmin] *yolu yaylağa gedən elata düşdü. Köç mənzil eləyib, heyvanları düzə buraxmışdı.* Ə.Haqverdiyev.

**ELBAŞI** *is. tar.* Eli idarə edən, elə başçılıq edən şəxs. [İldırım:] *Altay, elbaşı sən idin, deyilmi?* C.Cabbarlı.

**ELBAŞILIQ** *is. tar.* Elbaşının işi, vəzifəsi; başçılıq, rəhbərlik. [İldırım:] *Ən baş bir qanun vardır ki, o da hər kəsin başqaya zərərsiz azad istəyidir. "Ellik" işlər üçün isə el özü sıra ilə elbaşılıq edir.* C.Cabbarlı.

**ELBƏYİ** *is. tar.* El başçısı, el böyüyü; qəbilə, tayfa başçısı. *Halbuki İranda hakimlərin, elbəyilərin, kətxudaların və dövlət məmurlarının nəinki elmi yoxdur, hətta adi savadı da yoxdur.* M.F.Axundzadə. [Sön-

məz:] *El talanmışdır. Bir yandan ərəblər soyur, bir yandan elbəyilər talayır.* C.Cabbarlı.

**ELCARI** *zərf* 1. Elliklə, hamılıqla, bütünlüklə, başdan-başa. *Yüzlərcə gözəl başqa vilayətdə də çoxdur; Amma bizim ölkə bütün elcarı gözəldir.* Ə.Vahid.

2. Birlikdə, bütün elin iştirakı ilə. *Elcarı iş görmək.*

**ELÇİ** *is.* 1. *dipl.* Bir dövləti başqa bir dövlətdə təmsil edən diplomatik nümayəndə; səfir.

2. Oğlan və ya onun adamları tərəfindən qız istəmək üçün qız evinə göndərilən şəxs. [Səkinə xanım:] *Söz açıq gərək,* [Ağa Həsən] *məndən ötrü bibimin yanına elçi göndəribsən..* M.F.Axundzadə. *İndi ki var elçi də Səfdər kimi; Bir bala qız al, boyu ər-ər kimi.* M.Ə.Sabir. *Bir neçə il ondan sonra Mirzə qonşunun qızına eşq yetirib anasını elçi göndərdi.* Ə.Haqverdiyev. □ **Elçi düşmək** – qızı almaq üçün gedib-gəlmək, qız tərəfindən razılıq əldə etmək üçün çalışmaq, elçilik etmək. *Əmiqızı və əmioğlu sözü bu yerdə qoydular ki, Əmiraslan Gülpəri üçün əmisinə elçi düşsün.* S.S.Axundov. *Usta Murtuz elçi düşdü.* Mir Cəlal. **Elçi elçi üstündən gəlmək** – arası kəsilmədən qızı istəmək, bir-birinin dalınca elçi gəlmək. *..Zeynəbin adı bir elə şöhrət tapdı ki, elçi elçi üstdən gəlirdi.* C.Məmmədquluzadə.

3. Müəyyən məqsədlə və ya rəsmi danışıqlar üçün bir yerə göndərilən şəxs; nümayəndə. *Elçiyə zaval yoxdur.* (Ata. sözü). *Çindən gələn elçiyiz; Gətirmişiz xaqandan; Keykavusa ərməğan.* H.Cavid.

4. Ümumiyyətlə, nümayəndə mənasında. *Qabaq cərgələrdə əmirlər, vəzirlər, əyanlar və kübar ailələr yerləşmişdi. Elçilər və heyət nümayəndələri üçün başqa yerlər təxsis edilmişdi.* M.S.Ordubadi.

5. *məc.* Müjdəçi, xəbər gətirən mənasında. *İlk baharın uğurlu elçiləri olan qaranquş, sığırçın və leylək sürü-sürü dönüb yuvalarını tikəcək.* A.Şaiq. *Baharla birlikdə onun şux elçiləri: qaranquşlar hərəni öz dilində qarşılayırdılar.* M.Rzaquluzadə.

◊ **Elçi daşı** – nağıllarda: padşah qızının elçiliyinə gələnlərin oturması üçün saray meydanında qoyulan xüsusi daş.

**ELÇİLƏMƏ** "Elçiləmək"dən *f.is.*

**ELÇİLƏMƏK** *f.* Elçi düşmək, elçiliyə getmək, qız istəmək.

**ELÇİLİK** *is.* 1. Elçinin vəzifəsi, işi. // Elçinin idarəsi. *Elçilikdə qəbul.*

2. Elçi getmə, qız istəmə. [Gülpəri:] *Hacı, qadan alım, mənim elə saçım elçilikdə ağarmayıbdırmı?* Ə.Haqverdiyev. [Toğrul:] *Adə Yaşar, mən istəyirəm axı səni .. elçiliyə göndərim.* C.Cabbarlı. *Mirzə Rəhman hələ evdən çıxmamış elçilik qaydalarından söhbət salıb məsləhətləşmişdi.* Mir Cəlal. □ **Elçilik eləmək** – elçi sifəti ilə gedib qız istəmək. [Süleyman Əsgərə:] *Gördüyün qızlardan birisini seç, sonra lələşini göndər, gedim elçilik eləyim, vəssalam.* Ü.Hacıbəyov. [Rəşid:] *Gərək mənim elçiliyimi Məşədi bəy özü eliyə.* M.Hüseyn.

**ELDARŞAMI** *is. bot.* Azərbaycanın Eldar deyilən yerlərində bitən şam ağacı növü. *Eldarşamı .. enli çətirli, gövdəsi düz və ya əyilmiş olan, 18-20 metrə qədər hündürlüyündə ağacdır. İynələri qısa budaqlar üzərində ikişər yerləşir.* H.Qədirov.

**ELDAŞ** *is.* Biryerli, həmyerli, həmvətən. *Təyyarənin qanadı toxunur buludlara; Eldaşlarımız gəlir boşluğu yara-yara.* R.Rza.

**ELÉGİYA** [*yun.*] *ədəb.* 1. Mərsiyə tərzində yazılmış şeir. *Elegiya qəmli, kədərli, hüznlü lirik şeir deməkdir. Ölənlərin xatirəsinə yazılmış bu şeirlərdə, bizim mərsiyələrdə olduğu kimi, ağı ünsürləri əsas yer tuturdu.* Ə.Sultanlı. // Antik poeziyada: məsnəvi şəklində yazılmış şeir.

2. Həzin musiqi əsəri.

**ELEKTRÍÇKA** [*rus.*] *dan.* Elektrik dəmiryol qatarı (vaqonu). *Bakı ilə mədən rayonları arasında elektriçka işləyir.*

**elektro...** Mürəkkəb sözlərin, elektrik mənasında olan birinci hissəsi; məs.: elektroaparat, elektrobur, elektrovoz.

**ELEKTRÍK** [*yun.*] 1. Materiyanın, yüklü hissəciklərdən: elektronlardan, pozitronlardan, protonlardan və s.-dən ibarət forması. *Elektrik haqqında nəzəriyyə.*

2. Xalq təsərrüfatının bütün sahələrində və məişətdə işlədilən enerji növlərindən biri. *İşlər elektriklə görünür. Elektrik stansiyasının gücü.*

3. Bu energiyadan hasil olan işıq. *Elektrik çəkmək. Elektriki söndürmək.*

4. Elektriklə işləyən, elektriklə hərəkətə gətirilən. *Elektrik motoru. Elektrik peçi. Elektrik saatı. Elektrik aqreqatı.* // Elektrikdən alınan, hasil edilən. *Elektrik işığı. – Məşədi Əsgər o tərəfə baxıb gördü ki, bir böyük ev var, qapısının üstündə elektrik fənəri asılıbdır.* S.M.Qənizadə. *Otaq pis deyil idi, student otağına məxsus hər bir şey var idi: yazı masası, kürsü, əlüzyuyan, çarpayı, hətta elektrik işığı da yerində idi.* Çəmənzəminli. [Qadın] *sonra qolumdan tutub çəhrayı abajurlu elektrik çırağının altında qoyulmuş ağ örtüklü stola tərəf çəkdi.* İ.Əfəndiyev. // Elektrik hasil edən, elektrik verən, elektrik saçan. *Bayıl elektrik stansiyası. Elektrik batareyası. Elektrik dövrəsi* (elektrik cərəyanı keçən yol). *– ..Elektrik stansiyasından Ağbulağa işıqlar yayılırdı.* S.Rəhimov. □ **Elektrik vaqonu (qatarı)** – bax **elektriçka**. *..Qayıdırdım. Gecə saat on birdə elektrik vaqonuna oturdum.* S.Hüseyn. *Stansiyadan hələ on-on beş addım ayrılmamışdılar ki, elektrik qatarı yola düşüb getdi.* M.Rzaquluzadə.

◊ **Elektrik stulu** – ABŞ-da ölüm cəzası aləti. *“Ağ ev”in icadıdır elektrik stulu; Oturub o stulda yandırdılar Makgini.* S.Rüstəm.

**ELÉKTRİK** [*fr.* əsli *yun.*] 1. Bax **elektrotexnik**.

2. Elektrotexnika sahəsində, elektrik sənayesində işləyən, elektriki tədqiq edən şəxs.

**ELEKTRİKKEÇİRMƏ** *is. fiz.* Cismin elektrik cərəyanını keçirmə qabiliyyəti. *Metalın elektrikkeçirmə qabiliyyəti.*

**ELEKTRİKLƏNDİRİLMƏ** “Elektrikləndirilmək”dən *f.is.*

**ELEKTRİKLƏNDİRİLMƏK** *məch. fiz.* Elektrik yükü ilə yüklənmək.

**ELEKTRİKLƏNDİRMƏ** “Elektrikləndirmək”dən *f.is.*

**ELEKTRİKLƏNDİRMƏK** *f. fiz.* Cismi elektrik yükü ilə yükləmək. *Metalı elektrikləndirmək.*

**ELEKTRİKLƏNMƏ** “Elektriklənmək”-dən *f.is.*

**ELEKTRİKLƏNMƏK** *f. fiz.* Elektrik yükü qəbul etmək.

**ELEKTRİKLƏŞDİRİLMƏ** “Elektrikləşdirilmək”dən *f.is. Kənd təsərrüfatının elektrikləşdirilməsi. Dəmiryollarının elektrikləşdirilməsi. – Mingəçevir eyni zamanda kəndlərimizin elektrikləşdirilməsinə imkan yaratmışdır.* İ.Əfəndiyev. *Azərbaycanın neft sənayesi özünün mexanikləşdirilmə və elektrikləşdirilmə dərəcəsinə görə dünyada ən qabaqcıl yerlərdən birini tutur.* M.Qaşqay.

**ELEKTRİKLƏŞDİRİLMƏK** “Elektrikləşdirmək”dən *məch.*

**ELEKTRİKLƏŞDİRMƏ** “Elektrikləşdirmək”dən *f.is.* // Elektrik enerjisinə keçirmə, elektrik enerjisi tətbiq etmə.

**ELEKTRİKLƏŞDİRMƏK** *f.* Xalq təsərrüfatının bütün sahələrinə elektrik energiyasını tətbiq etmək; hər şeyi elektrik qüvvəsinə keçirmək. *Ölkənin başdan-başa elektrikləşdirilməsi. –* [Eyvaz:] *Dəyirmanı elektrikləşdirmək üçün balaca bir layihə düzəldib verdim Qədir kişiyə..* İ.Əfəndiyev.

**ELEKTRİKLƏŞMƏ** “Elektrikləşmək”-dən *f.is.*

**ELEKTRİKLƏŞMƏK** bax **elektriklənmək**.

**ELEKTRİKLİ** *sif. fiz.* Elektrikləşdirilmiş, elektrik yükü olan. *Elektrikli cisim. Elektrikli naqil.*

**ELEKTROAPARÁT** *tex.* Elektriklə işləyən cihaz, elektrik aparatı.

**ELEKTROBUCURQAD** *tex.* Elektriklə işləyən bucurqad.

**ELEKTROBUCURQADÇI** *is. xüs.* Elektrobucurqadda işləyən fəhlə.

**ELEKTROBÚR** [*rus.*] *tex.* Neft və s. quyuları qazımaq üçün elektrikli mühərriki olan buruq maşını. *..Mühəndislərin ixtira etdiyi elektrobur qazımada yüksək məhsuldarlıq nümunəsi göstərdi.* S.Quliyev.

**ELEKTRÓD** [*yun.* elektron və hodos – yol] *fiz.* Elektrik cərəyanını maye və qazların içinə daxil etmək üçün lövhəcik, şar və s. şəklində keçirici. *Müsbət elektrod* (*anod*). *Mənfi elektrod* (*katod*). *Rentgen borucuqları elektrodu.*

**ELEKTRODİNAMÍK** *sif.* [*yun.*] *fiz.* Elektrodinamika hadisələrinə aid olan. *Elektrodinamik sahə.*

**ELEKTRODİNÁMİKA** [*yun.*] Fizikanın elektrik yüklərinin qarşılıqlı təsirindən və hərəkətindən bəhs edən şöbəsi.

**ELEKTROFİZİOLÓGİYA** [b a x **elektro** və **fiziologiya**] Fiziologiyanın elektrik hadisələrinin orqanizmə təsirini öyrənməklə məşğul olan bölməsi.

**ELEKTROXÓD** [*rus.*] Elektrik mühərriki ilə işləyən gəmi.

**ELEKTROKARDİÓQRAF** [b a x **elektro** və **kardioqraf**] Ürək əzələlərinin fəaliyyəti zamanı onda əmələ gələn elektrik impulslarını qeyd edən elektrik cihazı.

**ELEKTROKARDİOQRÁFİYA** [b a x **elektro** və **kardioqrafiya**] Ürək əzələlərinin fəaliyyəti zamanı onda əmələ gələn elektrik impulslarının qrafik qeyd olunması ilə ürəyin fizioloji xassələrini yoxlama üsulu.

**ELEKTROKARDİOQRÁM** [b a x **elektro** və **kardioqram**] Elektrokardioqraf cihazı vasitəsilə ürəyin fəaliyyətinin qrafik təsviri.

**ELEKTROKÍMYA** [*yun.* elektron və *ər.* kimya] Fiziki kimyanın elektrik prosesləri ilə kimyəvi proseslər arasındakı əlaqəni öyrənən şöbəsi.

**ELEKTROKİMYƏVİ** *sif.* [*yun.* elektron və *ər.* kimyəvi] Elektrokimyadan istifadə ilə bağlı olan. *Elektrokimyəvi təhlil. Elektrokimyəvi üsul.*

**ELEKTROLÍT** [*yun.* elektron və lutos – həll olunmuş] İçərisindən elektrik cərəyanı keçdikdə, öz tərkib hissələrinə ayrılan kimyəvi maddə.

**ELEKTROLİTÍK** *sif.* [*yun.* elektron və lutos-dan] *kim.* Elektrolizə aid olan, elektrolizlə əlaqədar olan. *Elektrolitik üsul.* // Elektroliz yolu ilə alınan. *Elektrolitik dəmir* (*mis*).

**ELEKTRÓLİZ** [*yun.* elektron və lusis – həll etmə] *kim.* Maddənin içindən elektrik cərəyanı keçdikdə onun öz tərkib hissələrinə və elektrodlara ayrılması prosesi.

**ELEKTROMAQNETÍZM** [b a x **elektro** və **maqnit**] *fiz.* Elektrik axımının əmələ gətirdiyi maqnit hadisələri.

**ELEKTROMAQNÍT** [b a x **elektro** və **maqnit**] 1. İçərisindən elektrik cərəyanı axan maqnitləndirici məftillər sarınmış dəmir oxdan ibarət cihaz.

2. *sif.* Elektromaqnetizmə aid olan. *Elektromaqnit nəzəriyyəsi. Elektromaqnit dalğalar.* // Elektromaqnit vasitəsilə işləyən. *Elektromaqnit siqnalı.*

**ELEKTROMAŞIN** [b a x **elektro** və **maşın**] Elektrik maşını (elektrik enerjisi hasil edən, yaxud onu mexaniki enerjiyə çevirən maşın).

**ELEKTROMEXÁNİKA** [b a x **elektro** və **mexanika**] Elektrotexnikanın, elektrik qüvvəsi ilə işləyən mühərriklərin, maşınların, mexanizmlərin qayrılması və işlənməsi üsullarından bəhs edən şöbəsi.

**ELEKTROMEXÁNİKİ** *sif.* [*yun.* elektron və mechanika-dan] Elektrik və mexaniki təsirə əsaslanan. *Metalların elektromexaniki işlənməsi.*

**ELEKTROMETALLURGÍYA** [b a x **elektro** və **metallurgiya**] Metallurgiyanın elektrik enerjisi vasitəsilə metallar və müxtəlif ərintilər istehsalı ilə məşğul olan sahəsi.

**ELEKTRÓMETR** [*yun.* elektron və metreo – ölçürəm] *fiz.* Elektrik gərginliyini, elektrik potensialını ölçmək üçün cihaz.

**ELEKTROMETRÍK** *sif.* [*yun.* elektron və metreo-dan] *fiz.* Elektrometriyaya aid olan.

**ELEKTROMÉTRİYA** [*yun.* elektron və metreo] *fiz.* Elektrik vasitəsilə ölçmə üsul və metodları.

**ELEKTROMONTÁJ** [b a x **elektro** və **montaj**] *tex.* 1. Elektrik avadanlığının, elektrik qurğularının montajı (quraşdırılması).

2. *sif.* Elektromontaja aid olan. *Elektromontaj briqadası. Elektromontaj sexi.*

**ELEKTROMONTAJÇI** *is.* Elektromontaj mütəxəssisi.

**ELEKTROMONTYÓR** [b a x **elektro** və **montyor]** Elektrik avadanlığına xidmət edən, bu avadanlığı yığma, qurma və təmir işləri ilə məşğul olan ixtisaslı fəhlə.

**ELEKTROMOTÓR** [b a x **elektro** və **motor**] Elektrik mühərriki.

**ELEKTRÓN**[1] [*yun.*] 1. Maddənin mənfi elektrik yükü olan ən kiçik zərrəciyi.

2. *sif.* Elektronla, elektron tətbiqi ilə bağlı olan. *Elektron mikroskop. Elektron avtomatika. Elektron hesablama maşını.*

**ELEKTRON**[2] [*yun.*] 1. Çox möhkəm və plastiklik xassəsinə malik olan alüminiumla maqnium ərintisi.

2. *sif.* Elektrondan qayrılmış, elektronlu. *Elektron bombası.*

**ELEKTRÓNİKA** [*yun.*] Fizikanın, qazlarda, boşluqlarda, bərk cisimlərdə elektron proseslərini tədqiq edən şöbəsi. // Elm və texnikanın müxtəlif qurğularda və s.-də elektron və yarımkeçirici cihazlardan istifadə nəzəriyyə və üsullarında öyrənən sahəsi.

**ELEKTROÓPTİKA** [b a x **elektro** və **optika**] Fizikanın, elektrikin maddələrin optik xassələrinə təsirindən bəhs edən şöbəsi.

**ELEKTROSKÓP** [*yun.* elektron və skopeo – baxıram] Bir cisimdə elektrik yükünün olub-olmadığını yoxlamaq üçün cihaz.

**ELEKTROSTÁNSİYA** [b a x **elektro** və **stansiya**] Energiyanın başqa növlərindən elektrik enerjisi istehsal edən müəssisə. *Atom elektrik stansiyası. Su-elektrik stansiyası.*

**ELEKTROSTÁTİKA** [b a x **elektro** və **statika]** Fizikanın elektrikin, elektrikləşmiş cisimlərin nisbətən hərəkətsiz halda xassələrini öyrənən şöbəsi. *Hərəkət etməyən elektrik yüklərinin qarşılıqlı elektrik təsirini və onların tarazlıq şərtlərini öyrənən elmə* (*bəhsə*) *elektrostatika deyilir.* "Fizika".

**ELEKTROTÉXNİK** [b a x **elektro** və **texnik]** Elektrotexnika mütəxəssisi.

**ELEKTROTÉXNİKA** [b a x **elektro** və **texnika**] Elektrik enerjisinin tətbiqi haqqında elm, həmçinin texnikanın elektrik enerjisindən praktiki məqsədlər üçün istifadə edən şöbəsi.

**ELEKTROTEXNİKÍ** *sif.* [*yun*. elektron və technike-dən] Elektrotexnikanın tətbiqi və ya ondan istifadə ilə bağlı olan. *Elektrotexniki avadanlıq.*

**ELEKTROVÓZ** [*rus.*] *tex.* Elektrik qüvvəsi ilə işləyən lokomotiv. *Elektrovoz istehsalı.*

**ELEMÉNT** [*lat.*] 1. *kim.* Adi kimyəvi üsullarla öz tərkib hissələrinə ayrıla bilməyən, digər mürəkkəb maddələrin isə tərkib hissəsi olan bəsit maddə. *Mendeleyevin elementlərin dövri sistemi. – Yerin təkində bəzi mədənlər bir-birindən ayrı halda yerləşmir. Məsələn, mis yatağı olan yerdə çox vaxt sink, qurğuşun, qalay, mərgümüş və s. bu kimi elementlərin də yataqları olur.* M.Qaşqay.

2. *fiz.* Kimyəvi enerji hesabına yaradılan zəif elektrik qüvvəsi mənbəyi olan cihaz. *Qalvanik element. Quru element.*

3. Tamın, bütövün tərkib hissəsi. *Şeirdə əsas istiqamət və üslubdan tutmuş ən xırda elementlərə qədər hər bir şey həyati zərurət nəticəsində əsas yaradıcı kadrların iş prosesində qəbul və ya rədd edilir.* M.Rzaquluzadə. // *xüs.* Hər hansı bir maşının, qurğunun, mexanizmin əsas hissəsi.

4. *dan.* Adam, şəxs, ünsür.

**ELEMENTÁR** *sif.* 1. İbtidai, başlanğıc, bir şeyin ancaq əsaslarına aid olan. *Elementar cəbr. Elementar riyaziyyat.*

2. Ən sadə, ən bəsit, ibtidai. *Elementar məsələ. Ən elementar şeyi bilmir.*

3. Ən vacib, ən lazımlı, əsas. *Elementar şərait.*

4. *kim.* Bir şeyin elementlərinin tərkib hissəsinin və aralarındakı nisbətin müəyyənləşdirilməsi ilə əlaqədar olan. *Maddənin elementar tərkibi. Elementar təhlil.*

**ELEMENTARLIQ** *is.* Bəsitlik, sadəlik, ibtidailik.

**ELEVÁTOR** [*lat.*] 1. Böyük taxıl tədarükü məntəqələrində, dəmiryol stansiyalarında, limanlarda və s.-də tikilən, taxılı qaldırmaq, qurutmaq, saxlamaq üçün müvafiq qurğuları olan çox böyük anbar. *Taxılı saxlamaq üçün ən yararlı anbar elevatordur.*

2. Yükü arası kəsilmədən nəql edən qaldırıcı mexanizm. *..İki gənc fəhlə rotora yaxınlaşıb elevatorları hazırlayır.* M.İbrahimov.

**ELƏ** *əvəz.* 1. O cur, o təhər, o sayaq. *Elə söz demək olmaz. Elə sözlər danışma. – ..Şəxs gərək elə bir iş tutsun ki, onu bacarıb yerinə yetirməyə qabiliyyəti olsun.* C.Məmmədquluzadə. *Gəl elə kişnəmə, saqın, kəhərim!* R.Rza. [Cuma] *Maralın evində elə danışdığına .. görə özünü məzəmmət edirdi.* Ə.Əbülhəsən. *Aslan köntöy-köntöy cavab verdi*: *– Getmirəm. Hamı necə, mən də elə.* M.Hüseyn. // O dərəcədə, o şəkildə. *Bu it Qaraca qızla elə dost olmuşdu ki, yanından ayrılmaq istəmirdi.* S.S.Axundov. *Məsmə iki əli ilə dizlərinə elə çırpdı ki, səsini hamı eşitdi.* Mir Cəlal.

2. Ancaq, təkcə, yalnız, məhz mənasında. *Elə mən deyiləm hüsnünə mayil; Göz dikibdir tamam Qarabağ sənə.* Q.Zakir. *Məsumə xanıma da elə bu söz lazım idi.* P.Makulu.

3. *dan.* O tərəfə, o yana, o səmtə. *Mən belə gəldim, o elə getdi.* – [Qatırçı:] *Hax-*

*çılar zınqırovlu faytonlarda pırıltı ilə budu belə gəlirdi, odu elə gedirdi.* Mir Cəlal.

4. Cəm şəklində: **elələr(i)** – o cür (elə) adamlar. *Amma elələri də var ki, heç bir iş görməyib, övqati-əzizələrini mütləq bikarçılıqda zaye edirlər.* F.Köçərli. *Elələrini şəhərdən sürgün etsələr də azdır.* M.Hüseyn.

5. Ədat kimi aid olduğu sözün mənasını dəqiqləşdirir. *Elə bu saat çağırtdır. Elə özü də bu işi görmək istəyirdi. – Elə biri qonşun Qara Kərəmoğlu, müəllimlərə onotaqlı, eyvanlı, bağçalı ev tikdirib.* M.İbrahimov. [Uğur:] *Məni .. dilə tutan elə Alxan özü olmadımı?* İ.Əfəndiyev.

6. "də" ədatı ilə: 1) o cür də, o qaydada, o tərzdə. *Pişik ilə nə tövr rəftar eyləyirsən, elə də arvad ilə lazımdır rəftar eləmək.* C.Məmmədquluzadə; 2) o halda, belə olan surətdə. *Yaxşı, elə də sən get, mən də gələrəm;* 3) olduğu kimi, o cür. *Necə idisə, elə də qalıb.*

7. "ki" bağlayıcısı ilə: o zaman ki, necə ki, onda ki mənalarında zaman anlayışı verir. *Elə ki, qəti qərara gəldi, fikrindən dönməzdi.* M.İbrahimov. *Elə ki, bu çalsaqqal kişi göy örtüklü stolun dalına keçdi, daha üzünü görmə!* Mir Cəlal. *Elə ki, boz inək soyulub qurtardı, maraq daha da artdı.* Ə.Vəliyev.

◊ **Elə-belə** – 1) havayı, müftə. *– Bunu mənə neçəyə verirsən? – Elə-belə.;* 2) məqsədsiz, qərəzsiz, ümumiyyətlə. *Maya uzaqlara getdiyini duyaraq tez əlavə etdi: – Bunu elə-belə, yadıma düşdü, dedim.* M.İbrahimov. *Bu sözləri o, bəlkə də elə-belə, zarafatla demişdi.* M.Rzaquluzadə; 3) nə yaxşı, nə pis, babat. *Elə-belə bir ev tikdirdi.* **Elə-beləcə** – tərpənmədən, vəziyyətini dəyişmədən, necə var elə. [Firidun] *elə-beləcə uzanaraq nəhayətsiz göylərə tamaşa eləmək istəyirdi.* M.İbrahimov. **Elə bil (ki)** – sanki, guya ki. *Hamı tərtəmiz geyinib, elə bil ki, toya gedəcəkdir.* C.Cabbarlı. *Bəndalı gələndə elə bil daş-divar da dilə gəlir..* Mir Cəlal. *Adamlar elə bil ümumi komanda ilə Tahirə sarı baxdılar.* M.Hüseyn. **Elə bilmək** – zənn etmək, güman eləmək, sanmaq. *Tar gördüm, tələ bildim; Çağırdın, gələ bildim; Bir yatmış ceyran gördüm; Yar yatıb elə bildim.* (Bayatı). *Elə bilsin ki, padşahi-zamandır; Hər kim iraq olur, müxtəsər, səndən.* Q.Zakir. **Elə gəldi ki, elə gəlir ki** – zənn etmək, düşünmək, güman etmək mənasında. *Ona elə gəldi ki, qızı harada isə görüb. Mənə elə gəlir ki, bu kitabı oxumuşam. – Fikrim, hissim, xəyalım o qədər yüksəldi ki, mənə elə gəldi ki; Bizlərdən əvvəl nə yer, nə göy, nə həyat olmuş...* M.Müşfiq. *Kişiyə elə gəlirdi ki, onun ümid və arzu ilə bərkiyən qəlbi dərd ilə əriyir, qan olub tökülür.* Mir Cəlal. **Elə isə** – onda, belə olduqda, belə isə, belə şəraitdə. *Elə isə mən də getdim! – deyə Tahir nəfəsini çəkmədən səbirsizliklə dostundan cavab gözlədi.* M.Hüseyn.

**ELƏCƏ** *zərf* Olduğu kimi, dəyişmədən, necə varsa, elə. *Zeynal bayaqdan bəri qabağındakı nimçədə doğramaq istədiyi bir parça əti eləcə qoyub əlindəki .. bıçağı yerə buraxdı.* S.Hüseyn. // "də" ədatı ilə bağlayıcı mənasında işlənir.

**ELƏLİK** *is.* Hal, vəziyyət, xasiyyət bildirir. [Kosaoğlu:] *Eləliyinə baxma, şuluq uşaqdır.* İ.Şıxlı.

**ELƏMƏK** "Etmək" felinin üslubi variantı. *Məclisi alud elər; Zülflərinin hər burması.* Molla Cümə. *Elə, Heyran, bu şükri nə qədər ömrün var.* Heyran xanım. *...Atam heç şəhərli də deyil idi ki, bəylərə bazarlıq eləyə-eləyə* (z.) *axırda bir yalançıq bəylik qazana idi.* C.Məmmədquluzadə.

**ELƏTDİRMƏK** "Eləmək"dən *icb.* b a x **etdirmək**. [Züleyxada] *pul yox idi ki, onu dəfn elətdirsin.* C.Cabbarlı. *Sitarənin bəxtinə məşvərət elətdirmək istəyirdi.* Mir Cəlal.

**ELƏTMƏ** "Elətmək"dən *f.is.*

**ELƏTMƏK** 1. B a x **elətdirmək.**

2. *qədimi.* Aparmaq. *Ey badi-səba, bəndən elət yarə səlami.* Nəsimi. *Eylət məni yar olan diyara; Şəm eylə məni məzari-yarə.* Füzuli.

**EL-GÜN** *is.* Xalq, camaat, el. *El-gün içində biabır olmaq. – Eşq üçün babamı atıb, tərk etmək; Ölümdən yamandır el-gün içində...* S.Vurğun.

**ELİ´T(A)** [*fr.*] *k.t.* 1. Bitki və heyvanların ən seçmə, ən yaxşı nüsxələri. *Ən yaxşı heyvanlar elit qrupuna daxil edilir.* (Qəzetlərdən).

2. Cəmiyyətin yüksək təbəqəsi.

**ELÍZİYA** [*lat.*] *dilç.* bax **düşüm**² (**səs düşümü**).

**ELQOVAN** *is.* Yayın ikinci yarısına düşən və eli dağdan arana köçməyə məcbur edən soyuq hava (çox vaxt "elqovan ay" şəklində). *Tutdu dağı çən boran; Gəldi yenə elqovan.* H.K.Sanılı.

**ELLƏŞDİRİLMƏ** "Elləşdirilmək"dən *f.is.*

**ELLƏŞDİRİLMƏK** bax **ellikləşdirilmək**.

**ELLƏŞDİRMƏ** "Elləşdirmək"dən *f.is.*

**ELLƏŞDİRMƏK** bax **ellikləşdirmək**.

**ELLƏŞMƏ** "Elləşmək"dən *f.is.*

**ELLƏŞMƏK** bax **ellikləşmək.** *Belə bir zamanda yatmaq yaraşmaz; Elləşir ölkəmiz, yatma, a tənbəl!* Aşıq Əziz.

**ELLİ** *sif.* 1 Vətəni, yurdu, eli olan. *Elli adam.*

2. Bir yerdən, bir eldən olan. *O mənim ellimdir. – Mən əminəm ki, calal sahibi olan cənabınızla elli olduğumuza görə, tərəfimdə duracaqsınız.* M.F.Axundzadə. [Südabənin anası:] *Südabə Həkimülmülkün qızı deyil. Bunun atası bizim öz yerlimiz, öz ellimiz idi.* M.İbrahimov. ◻ **Ağır elli** – böyük nəsli, çoxlu qohum-əqrəbası olan. *Ağır elli qız. – Xotkar qızı, şah nəsilli; Ağır elli, xan əsilli.* "Koroğlu".

**ELLİK** 1. *sif.* Bir yerin bütün camaatına, elinə məxsus olan, bütün xalqa aid olan; ictimai, ümumi. *Ellik bağ. Ellik yol. Ellik bayram. Ellik təsərrüfat.* – [İldırım:] *Ən baş bir qanun vardır ki, o da hər kəsin başqaya zərərsiz, azad istəyidir. Ellik işlər üçün isə el özü sıra ilə elbaşılıq edir.* C.Cabbarlı. *Ordu tirəndazları girdilər ellik bağa; Çalışdılar qalmasın ağacda bircə qarğa.* Ə.Cavad.

2. *zərf* Hamılıqla, elliklə, bütünlüklə, bütün el birlikdə. *Ellik şikayət etmək. Ellik iş görmək. – Ellik yerbəyerdən qalxıb dedilər: – Güloğlan, sazını vur qoltuğuna, var!* "Aşıq Qərib". *Dərslərim yetdikdə, dədə, axirə; Oxudular elliyi birdən-birə.* A.Səhhət. // *sif.* Bütün el tərəfindən görülən, ya görülməli olan. *Ellik iş.*

**ELLİKCƏ** *zərf* Bütün, başdan-başa, hamılıqca. *Ellikcə savadlanmaq. – Çox çəkməz ki, .. Dağıstan camaatı və dağlarda yaşayan əhali ellikcə savadlı və elm sahibi adamlar olacaqlar.* M.F.Axundzadə.

**ELLİKLƏ** bax **ellikcə**. *Adətən onlar* [göytəpəlilər] *çətinliyə düşəndə, elliklə bir iş lazım gələndə buraya toplaşıb ağsaqqallara qulaq asar, görüləcək işlər barədə tədbir tökərdilər.* İ.Şıxlı.

**ELLİKLƏŞDİRİLMƏ** "Ellikləşdirilmək"dən *f.is.*

**ELLİKLƏŞDİRİLMƏK** *məch.* İctimailəşdirilmək; bütün elin, xalqın, camaatın istifadəsinə verilmək.

**ELLİKLƏŞDİRMƏ** "Ellikləşdirmək"dən *f.is.*

**ELLİKLƏŞDİRMƏK** *f.* İctimailəşdirmək; bütün elin, camaatın, xalqın istifadəsinə vermək; xalqın, elin malı etmək.

**ELLİKLƏŞMƏ** "Ellikləşmək"dən *f.is.*

**ELLİKLƏŞMƏK** *f.* İctimailəşmək, bütün elin malı olmaq.

2. Dirijabl və aerostatların saxlandığı yer.

**ELLİNÍST** [*yun.*] *köhn.* Qədim yunan filologiyası mütəxəssisi. // Ellinizm mədəniyyətinə pərəstiş edən adam.

**ELLİNÍZM** [*yun.*] 1. Makedoniyalı İskəndərin Şərqi istilasından sonra başlanan qarışıq yunan-Şərq mədəniyyətinin çiçəklənməsi dövrü. *Tarixçilər Makedoniyalı İskəndərin hakimiyyət illərindən başlayaraq imperatorluğun xərabələri üzərində qurulmuş dövlətlərin Roma idarəsi altına keçməsinə qədər olan dövrü şərti olaraq ellinizm dövrü adlandırırlar.* Ə.Sultanlı.

2. Qədim yunan dilindən başqa dillərə keçmiş söz və ya ifadə.

**ÉLLİNQ** [*holl.*] *xüs.* Gəmi qayırmaq və ya təmir etmək üçün qurğu.

**ELLİNLƏR** [*yun.*] Qədim yunanların özlərinə verdikləri ad. *Ellinlərin əcdadı əfsanəvi Ellin hesab olunur.*

**ÉLLİPS, ÉLLİPSİS** [*yun.* elleipsis – qüsur] 1. *riyaz.* Konus, ya silindrin müstəvi ilə kəsişməsindən hasil olan qapalı əyri xətt. // Bir cismin bu qapalı əyri xətti xatırladan çevrəsi.

2. *dilç.* Cümlədə, asanlıqla anlaşılan sözün buraxılmasından ibarət ritorik üsul.

**ELLİPSÓİD** [*yun.*] *riyaz.* Ellipsin öz oxlarından birinin ətrafında fırlanması nəticəsində hasil olan səth.

**ELLİPTÍK** *sif.* [*yun.*] 1. Ellipsə oxşar, ellips kimi, ellips şəklində. *Cismin elliptik şəkli.*

2. *dilç.* Cümlədə asanlıqla anlaşılan sözün buraxılmasına əsaslanan. *Elliptik cümlə.*

**ELM** *is.* [*ər.*] Təbiət və cəmiyyətin inkişafındakı qanunauyğunluqları və obyektiv aləmə təsiri üsullarını meydana çıxaran biliklər sistemi və bu biliklərin ayrıca sahəsi. *Kimya elmi. Riyaziyyat elmi. Texniki elmlər. İctimai elmlər. – Vaxtbavaxt "Şərq-Rus"un səhifələrini əsr və zəmanəmizin şüəra və ədibləri öz gözəl və abdar əşar və kəlamları ilə müəyyən qılırlar və müsəlman qardaşları elm və maarif kəsbinə dəvət edirlər.* F.Köçərli. // İnsan biliklərinin müəyyən bir sahəsi (bir peşə kimi). *Elmlə məşğul olmaq. Həyatını elmə sərf etmək.* // Oxumaqla əldə edilən bilik, məlumat. *Oxuyaq, elm oxumaqlıq dəmidir; İndi aləm dəxi elm aləmidir.* A.Səhhət. *Elmü ürfan qazanmağa getdiyi yerdə; Əsir oldu, aşiq oldu qumral qıza.* Ə.Cavad. // *dan.* Bəzən savad, məlumat mənasında. *Onun elmi yoxdur.*

**ELMİ** *sif.* [*ər.*] 1. Elmə aid, elmlə əlaqədar. *Elmi əsər. Elmi fəaliyyət. Elmi kəşf.* – [Əhməd] *məqalələr yazır, iclaslarda çıxış edir, elmi əsərlər üzərində çalışırdı.* S.Rəhimov. [Murad] *hər addımında rast gəldiyi, eşitdiyi, gördüyü və inandığı elmi nailiyyətlər sayəsində Əzizin vaxtı ilə kənddə tez-tez institutdan danışmasına .. haqq verirdi.* Ə.Vəliyev. // Elmin hər hansı bir məsələsi, sahəsi ilə məşğul olan. *Elmi işçi. Elmi idarə. Elmi cəmiyyət.*

2. Elmi prinsiplərə əsaslanan, elmi tələblərə cavab verən, elmi məqsəd daşıyan. *Elmi nəzəriyyə. Elmi mühazirə. Elmi ekspedisiya. Elmi konfrans. – Şeydanın həm elmi əsasları, həm də fərziyyələri* [Qədirə] *çox inandırıcı görünürdü.* M.Hüseyn. *Füzuli yaradıcılığının sinfi xasiyyəti və xüsusilə onun əsərlərində təzadlı cəhətlər bu vaxta qədər düzgün, elmi izah olunmamışdır.* M.İbrahimov.

**ELMİ-FANTASTİK** *sif.* Elmi əsaslar üzərində qurulmuş fantastikaya aid olan. *Elmi-fantastik roman.*

**ELMİ-KÜTLƏVİ** *sif.* Elm və texnikanın nailiyyətləri ilə geniş oxucu kütləsini aydın və sadə bir dillə tanış edən. *Elmi-kütləvi ədəbiyyat. Elmi-kütləvi mühazirələr.*

**ELMİLİK** *is.* Elmi olma, elmə əsaslanma, elmi mahiyyət daşıma. *Nəticələrin elmiliyi. Sübutların elmiliyi.*

**ELMİ-NƏZƏRİ** *sif.* Həm elmi, həm nəzəri əhəmiyyəti olan, həm elmi, həm nəzəri mahiyyət daşıyan. *Elmi-nəzəri məsələ. Elmi-nəzəri konfrans.*

**ELMİ-POPULYAR** bax **elmi-kütləvi**.

**ELMİ-TEXNİKİ** *sif.* Texniki elmlər sahəsinə aid olan. *Elmi-texniki ədəbiyyat.*

**ELMİ-TƏTBİQİ** *sif.* Həm elmi, həm də tətbiqi əhəmiyyəti olan, həm elmdə, həm də praktikada tətbiq oluna bilən. *Elmi-tətbiqi nəticə.*

**ELMLƏNDİRMƏ** "Elmləndirmək"dən *f.is.*

**ELMLƏNDİRMƏK** *f.* Elm öyrətmək, savadlandırmaq.

**ELMLƏNMƏ** "Elmlənmək"dən *f.is.*

**ELMLƏNMƏK** *f.* Təhsil almaq, elm öyrənmək, savadlanmaq.

**ELMLİ** *sif.* Təhsil görmüş, təhsil almış, təhsilli, oxumuş, ziyalı. *Elmli qazıya şahid lazım deyil.* (Ata. sözü). *Qızıl Arslanı bu izdivacdan razı salacaq üçüncü səbəb Təliənin əqilli, ədəbli, elmli və həddindən artıq gözəl olması idi.* M.S.Ordubadi. *Məlumdur ki, Fərhad qardaşından elmli və bilikli idi.* C.Cabbarlı.

**ELMSİZ** *sif.* Oxumamış, təhsilsiz, savadsız; cahil, avam. *Heç yerdə tərəqqi eləməz elmsiz insan; Bibəhrə olur gər su verilməzsə nihalə.* Ə.Vahid.

**ELMSİZLİK** *is.* Təhsilsizlik, savadsızlıq, cəhalət. *Çünki ümumi Vətən, millət işlərində elmsizlik bizi ayaq altına verir.* N.Nərimanov. *Millətin yüz minlərlə oğul və qızlarını ehtiyac, zülm və elmsizlik çəngəlindən qurtarmadan milli oyanma mümkün deyildi.* M.İbrahimov.

**EL-OBA** *top.* Camaat, el, xalq. *Əziziyəm, can sənə; Gəl kəsim qurban sənə; Nə sirdir, qalıbdır; El-oba heyran sənə?* (Bayatı). *El-oba Nəbini öz gözünün didəsi kimi qoruyub saxlasa da, Sarımsaqoğlu kimi şeytan-şuğul bu qızıl vədindən ötrü işə girişirdi.* S.Rəhimov.

**ELSİZ-OBASIZ** *sif.* Yurdu, məskəni olmayan. *Dilənçi Nurəddinin titrəməsini görüb dedi: – Məndən qorxma, oğlum, mən də elsiz-obasız bir dilənçiyəm.* S.S.Axundov.

**ELTİ** *is.* Qardaş arvadlarının bir-birinə olan qohumluq münasibəti, qayınxatın. [Şərəfnisə:] *Nəyi gizlətmişəm, ay elti?* M.Hüseyn.

**ELTÖKƏN** *is. məh.* Dağdan köçənə yaxın başlanan güclü yağış.

**EL-ULUS** *top.* Camaat, xalq, el. *Muğana su gəlir, Milə su gəlir; Axışıb öz eli-ulusu gəlir.* S.Vurğun. *Axşamlar, ay axşamlar; Şamlar yanar axşamlar; El-ulus evdə yatar; Xodək harda axşamlar.* (Bayatı).

**EL-YURD** *is.* El, vətən. [Babək:] *Bizim elimiz-yurdumuz var, anacan, sənin də, mənim də böyük bir anamız var – Vətən!* M.Rzaquluzadə.

**EM** "M" hərfinin adı.

**EMAL** *is.* [*ər.*] Müxtəlif əməliyyat vasitəsilə qayırma, hazırlama, düzəltmə, hazır şəklə salma. *Dəri emalı. Ağac emalı. Boru emalı.* □ **Emal etmək** – qayırmaq, hazırlamaq, düzəltmək, hazır şəklə salmaq.

**EMALATXANA** *is.* [*ər.* emalat və *fars.* ...xanə] 1. İstehsal və ya təmir müəssisəsi, habelə bu cür müəssisənin binası; karxana. *Xarrat emalatxanası. Tikiş emalatxanası.* – [İmran:] *Yoldaşlar, bu günlərdə burada böyük emalatxana açılacaq.* Ə.Haqverdiyev. *Bir azdan səs-küylə işləyən bir təmir emalatxanasına yaxınlaşdılar.* S.Rəhman. *Fərman o gündən dərsdən sonra da emalatxanada müəllimindən eşitdikləri sözlər haqqında xeyli düşündü.* Ə.Sadıq.

2. Rəssamın, heykəltəraşın iş otağı.

**EMALÇI** *is.* Hazırlayan, emal edən, istehsal edən. *Silos basdırıldıqdan sonra Budaq fermadakı süd maşınlarının yanına gələr, emalçılara yardım edər, inəklərin, qoyunların sağılıb, südün maşından keçirilməsində əlindən gələni əsirgəməzdi.* Ə.Vəliyev.

**EMALEDİCİ** *sif.* Emal edən, hazırlayan, istehsal edən. *Emaledici sənaye.*

**EMBÁRQO** [*isp.*] *hüq.* Bir ölkəyə mal gətirilməsinin və ya oradan mal çıxarılmasının qadağan edilməsi. // Bir dövlətin, cəza tədbirləri olaraq, başqa dövlətlərə məxsus gəmilərinin və yüklərinin öz limanına girməsini, yaxud oradan çıxmasını qadağan etməsi.

**EMBLÉM** [*yun.* emblema – nişan, qabarıq bəzək] Hər hansı bir anlayışı ifadə edən şərti əlamət, nişan, rəmz. *Göyərçin sülh emblemidir.*

**EMBRİOLÓGİYA** [*yun.* embryon – rüşeym və logos – anlayış, elm] Biologiyanın rüşeymlərin (embrionların) inkişafından bəhs edən şöbəsi. *Canlıların embrional inkişafından bəhs edən elmə embriologiya deyilir.* M.Axundov.

**EMBRİOLOJÍ** *sif.* [*yun.*] Embriologiyaya aid, embriologiyaya məxsus. *Embrioloji tədqiqat.*

**EMBRİÓLOQ** [*yun.*] Embriologiya mütəxəssisi.

**EMBRİÓN** [*yun.*] bax **rüşeym.** *Embrionun ana bətnində inkişafı.*

**EMBRİONÁL** *sif.* [*yun.*] *biol.* Embriona aid olan. *Embrional dövr. Embrional inkişaf.* // Embrion (rüşeym) halında olan. *Embrional hüceyrə.*

**EMFİZÉMA** [*yun.*] *tib.* 1. Bədənin bir yerində, ya toxumasında həddindən artıq hava, ya qaz yığılması. *Dərialtı emfizema.*

2. Ciyərlərin qeyri-normal böyüməsi, şişməsi.

**EMİSSÁR** [*lat.*] *dipl.* Hər hansı bir siyasi təşkilat və ya dövlət təşkilatı tərəfindən məxfi tapşırıqla başqa bir ölkəyə göndərilən şəxs.

**EMİSSİÓN** *sif.* [*lat.*] *mal.* Emissiyaya aid.

**EMÍSSİYA** [*lat.*] *mal.* Qiymətli kağızlar və kağız pullar buraxılması.

**EMOSİONÁL** *sif.* [*fr.*] 1. Emosiya ifadə edən, emosiya ilə dolu olan, həyəcanlı. *Emosional nitq.* – ..[S.Vurğunun] *dili çox aydın, səlis, emosional və obrazlıdır.* O.Sarıvəlli. *..Musiqi mədəniyyətinin yeni bir qələbəsi kimi qarşılanan "Yeddi gözəl" baletinin musiqisi .. emosional cəhətcə dolğun məzmunlu böyük bir ilham məhsuludur.* Ə.Bədəlbəyli.

2. Tez təsirlənən, tez həyəcanlanan, tez mütəəssir olan, özünü saxlaya bilməyən. *Emosional hal. Emosional xasiyyət.* – *Cabbarlı öz canlı bədii surətləri ilə tamaşaçıların yalnız şüuruna, mühakiməsinə deyil, eyni zamanda hissiyyatına, emosional varlığına da təsir etməyə çalışır.* M.Arif.

**EMOSİONALLIQ** *is.* Həyəcanlılıq, təsirlilik, həyəcan oyatma, təsirləndirmə qabiliyyəti. *Musiqinin emosionallığı.*

**EMÓSİYA** [*fr.* əsli *lat.*] Həyəcan, təəssürat.

**EMPÍRİK[1]** [*yun.* empeiria – təcrübə] 1. *fəls.* Empirizm (1-ci mənada) tərəfdarı.

2. Praktik işlə məşğul olan adam, empirizm (2-ci mənada) tərəfdarı.

**EMPİRÍK[2]** *sif.* [*yun.*] 1. Empirizm mahiyyətində olan. *Empirik sosiologiyanın metodikası.*

2. *kit.* Empirizmə, yalnız təcrübəyə əsaslanan, təcrübi. *Empirik üsul. Empirik düstur. – Ellinizm dövründə elm empirik xasiyyət daşıyırdı.* Ə.Sultanlı.

**EMPİRİKLİK** *is.* Empirizmə əsaslanma, empirizm mahiyyəti daşıma, təcrübilik.

**EMPİRİOKRÍTİK** [*yun.*] *fəls.* Empiriokritisizm tərəfdarı.

**EMPİRİOKRİTİSÍZM** [*yun.*] *fəls.* XIX əsrin axırlarında meydana çıxmış subyektiv idealist fəlsəfi cərəyan; maxizm. *Empiriokritisizm həmçinin fizikada böhranla, fiziki idealizm məktəbi ilə bağlı olmuşdur. Neopozitivizm "antimetafizik" empiriokritisizmin davamıdır.*

**EMPİRÍZM** [*yun.*] *fəls.* 1. İdrak üçün yalnız hissi qavrayışı, təcrübəni əsas hesab edən, nəzəri ümumiləşdirmələri qəbul etməyən fəlsəfi cərəyan. *Empirizm ilə rasionalizm arasında əsas ziddiyyətlər.*

2. *sif. kit.* Nəzəri cəhətin zərərinə olaraq, praktik cəhətə, əməli fəaliyyətə meyil; əməli fəaliyyət.

◊ **Sürünən empirizm** – ayrı-ayrı faktların dərin əlaqələrini və inkişaf qanunlarını açmadan öyrənilməsi; öyrənilən hadisələrə məhdud, qeyri-ciddi yanaşma.

**EMÚLSİYA** [*fr.* əsli *lat.*] *xüs.* 1. Bir mayenin başqa maye içərisində əriməyib qalan mikroskopik zərrələri.

2. Foto kağızı, ya lövhəcikləri üzərinə çəkilən fotokimyəvi şüalara həssas jelatin məhlulu. *Emulsiya təbəqəsi.*

**EMULSİYALAŞDIRILMA** "Emulsiyalaşdırılmaq"dan *f.is.*

**EMULSİYALAŞDIRILMAQ** *məch. xüs.* Emulsiya halına salınmaq, yaxud üzərinə emulsiya çəkilmək.

**EMULSİYALAŞDIRICI** *sif.* Emulsiya əmələ gətirən. *Emulsiyalaşdırıcı maddə.*

**EMULSİYALAŞDIRMA** "Emulsiyalaşdırmaq"dan *f.is.*

**EMULSİYALAŞDIRMAQ** *f. xüs.* Emulsiya halına salmaq, yaxud üzərinə emulsiya çəkmək.

**EMULSİYALI** *sif. xüs.* Üzərinə emulsiya çəkilmiş. *Qalın qatlı lövhələr vasitəsilə işıq hissəciklərinin, həmçinin "y" hissəciklərin də hərəkətini yazmaq mümkündür. Lakin sonuncu halda daha qalın emulsiyalı lövhələrdən istifadə edilməlidir.* A.Qarayev. // Tərkibində emulsiya olan. *Emulsiyalı neft.*

**EN[1]** 1. "N" hərfinin adı.

2. Formullarda şərti rəmz – latın hərfi "N", "n" ilə işarə olunaraq hər hansı bir kəmiyyəti bildirir.

**EN[2]** *is.* Bir şeyin köndələn vəziyyətdə uzunluğu. *Küçənin eni. Otağın eni. Parçanın eni. – Eni iki kilometrdən artıq olmayan* [torpaq] *bir zolaq kimi uzanıb gedirdi.* M.İbrahimov. [Tövlənin] *iyirmi səkkiz arşın uzunu, yeddi arşın yarım enidir.* Qantəmir. *Bu xəndək bir kilometr uzunluğu, qırx metr eni, otuz metr dərinliyi olan nəhəng bir dərədən ibarətdir.* Ə.Sadıq. ☐ **En dairəsi** *coğr.* – ekvatordan meridiana qədər olan (dərəcələrlə göstərilən) məsafə. *Cənub en dairəsi.* **En kəsiyi** *fiz.* – cismin oxuna perpendikulyar müstəvi ilə kəsiyi; eninə kəsiyi.

◊ **Enə vermək** – 1) kökəlmək; 2) eninə böyümək, eninə genişlənmək. *Bostandakı kələmlər enə verir, balqabaqlar qarınlarını şişirdir, pomidorların sifəti qızarırdı.* Ə.Vəliyev. **Eni ilə uzunu bir olmaq** – həddindən artıq kökəlmək, köklükdən yumrulaşmaq.

**ENDEMÍK** *sif.* [*yun.*] *xüs.* Yerli, müəyyən bir yerə xas olan. *Endemik xəstəlik. Endemik bitkilər.*

**ENDEMÍYA** [*yun.*] *xüs.* İnfeksiyanın qalmasına səbəb olan müəyyən şərait nəticəsində bir yerdə yoluxucu xəstəliyin daim mövcud olması.

**ENDİRİCİ** *sif. tex.* Bir şeyi, yükü, ağırlığı və s.-ni aşağı endirən.

**ENDİRİLMƏ** "Endirilmək"dən *f.is.*

**ENDİRİLMƏK** *məch.* Aşağı salınmaq, düşürülmək. *Yuxarıya qoyulmuş qırmızı stol salonun qabaq tərəfinə endirildi.* S.Rəhimov.

*Quyuya kəmər endirildikdən sonra, o, xüsusi aqreqatlar vasitəsilə sementlənir.* S.Quliyev.

**ENDİRİM** b a x **eniş**. *Yolun endirimi*.

**ENDİRİMLİ** b a x **enişli**.

**ENDİRMƏ** "Endirmək"dən *f.is.*

**ENDİRMƏK** *f.* 1. Aşağı salmaq, düşürmək, yaxud enməsinə, aşağı düşməsinə kömək etmək. *..Söz var ki, dağa çıxardar, söz var ki, dağdan endirər.* C.Məmmədquluzadə. *Arvad ərini geyindirib, qolundan yapışıb, pilləkəndən endirib qayıtdı.* Ə.Haqverdiyev.

2. Sallamaq, aşağı tutmaq. [Qız] *sanki bir şey xatırlamaq istəyir də, tapa bilməyir kimi, kirpiklərini mütəmadiyən endirib-qaldırır, baxışının vəziyyətini heç dəyişmirdi.* S.Hüseyn. *Hümmətəli bircə saat bundan əvvəl qoyulmuş çuqun peçin yanında oturub başını sinəsinə endirmişdi.* M.Hüseyn.

3. Aşağı çəkmək, aşağı sürüşdürmək. *Papağı gözünün üstünə endirmək. – ..Memar Sadıqzadə üstünə çəkdiyi ipək yorğanı sinəsinə qədər endirdi.* S.Rəhimov.

4. Aşağı salmaq, azaltmaq, ucuzlaşdırmaq. *Qiymətləri endirmək.*

5. *məc.* Vurmaq, ilişdirmək, çəkmək. *Ağac endirmək. Qapaz endirmək. Yumruq endirmək. Qılınc endirmək. – ..Xudayar bəyin əlində yekə dəyənək var. Nə vaxt keyfi istəyir qaldırır, nə vaxt istəyir endirir.* C.Məmmədquluzadə. *Naznaz əlini qaldırıb Qaraşın təpəsinə endirəndə Qaraş onun biləyindən yapışıb sıxdı.* M.İbrahimov. *Aslan atasının endirdiyi yumruq altından sivişib çıxdı.* M.Hüseyn.

6. *məc.* Düşürmək, salmaq, devirmək; məhrum etmək. *Dünən eşitdim ki, Şeyx Əbdülhəmidi taxtdan endirdilər.* C.Məmmədquluzadə. [Ağa Saleh:] *Biz ağaları bu büsatdan endirən olmaz.* S.S.Axundov.

7. *məc.* Lütf etmək, saymaq, iltifat göstərmək. *Xəbər alıb əhvalımı bilmirsən; Endiribən məclisimə gəlmirsən.* Aşıq Ələsgər. *Bilməyən azdır ayı; Lovğalıqda yox tayı; "Mən çox qəşəngəm", – deyə; Endirmədi kimsəyə.* Ə.Cavad.

**ENDOKÁRD(İ)** [*yun.* endo və kardia – ürək] *anat.* Ürək boşluğunu içəridən örtən qişa.

**ENDOKARDÍT** [*yun.* endo-daxilində və kardia – ürək] *tib.* Endokardın (ürəyin daxili qişasının) iltihabı.

**ENDOKRÍN** [*yun.* endo-daxilində və krino – ayırıram] *fiziol.* Daxili sekresiya vəziləri ilə bağlı olan. *Endokrin xəstəliklər.* □ **Endokrin sistem** *anat.* – endokrin vəzilər sistemi. **Endokrin vəzilər** *anat.* – daxili sekresiya vəziləri.

**ENDOKRİNOLÓGİYA** [*yun.* endo-daxilində və krino-ayırıram və logos-elm] Daxili sekresiya vəzilərinin quruluş və vəzifələrini öyrənən elm. *Eksperimental endokrinologiya.*

**ENDOKRİNÓLOQ** [*yun.* endo-daxilində və krino – ayırıram və logos-elm] Endokrinologiya mütəxəssisi.

**ENDOQÁMİYA** [*yun.* endo – daxilində və gamos – nikah] *etnoqr.* Cəmiyyətin ilk inkişaf dövrlərində ancaq qohumundan, tayfasından, ictimai qrupu içərisindən evlənmək adəti.

**ÉNDŞPİL** [*alm.*] *idm.* Şahmat oyununun son mərhələsi.

**ENERGÉTİK** [*yun.*] Energetika mütəxəssisi, energetika sənayesi işçisi. *Energetiklərin yeni nailiyyətləri.*

**ENERGETÍK** *sif.* [*yun.*] Energetikaya aid, enerji istehsalı və ondan istifadə ilə bağlı olan. *Qaldırıcı və fırlandırıcı mexanizmlər buruq içərisində, nasoslar və energetik quruluşlar isə buruğun yanındakı tikililərdə yerləşdirilir.* S.Quliyev.

**ENERGÉTİKA** [*yun.*] Xalq təsərrüfatının təbii enerji istehsalı və onun çevrilməsi üsullarını birləşdirən sahəsi, habelə texnikanın, enerjinin müxtəlif növlərinin istehsalı, tətbiqi və onlardan istifadə üsullarından bəhs edən şöbəsi.

**ENÉRGİYA** [*yun.*] b a x **enerji.** *Suyun tərkibində olan hidrogen daş kömürdən milyon və milyard dəfə daha çox energiya verə bilər.* A.Qarayev.

**ENERJÍ** [*yun.*] 1. *fiz.* Materiyanın əsas xassələrindən biri – onun hərəkət ölçüsü, materiyanın işıq, istilik, elektrik, mexaniki hərəkət və s. şəklində olan hərəkət ehtiyatı. *Atom enerjisi. Şüa enerjisi. – Enerjinin itməməsi və çevrilməsi qanunu təbiətin əsas qanunlarından biridir.* "Fizika". // Hər han-

sı bir cismin, maddənin və s.-nin bir iş görmə, yaxud iş görə bilən qüvvənin mənbəyi olma qabiliyyəti. *Suyun enerjisi. Akkumulyator enerjisi. – Nüvədaxili enerji ehtiyatları doğrudan da hədsiz-hüdudsuzdur.* A.Qarayev.

2. Qətiyyət, inad, coşqunluq, qüvvət, səy. ..[Firidunun] *enerji və qüvvətlə dolu qəlbi susmaq, həyatdan küsmək nə olduğunu bilmirdi.* M.İbrahimov. *Mirzəyev böyük həvəs və enerji ilə çalışırdı.* Ə.Sadıq.

**ENƏCƏK** *is. məh.* 1. Pilləkənin alt pilləsi. [Xanpəri] *həyətə xeyli baxdıqdan sonra balkona çıxmaq istədi. Ağlına nə gəldisə, enəcəkdə oturdu.* Ə.Vəliyev.

2. Eniş.

**ENİNƏ** *zərf.* Köndələninə, bir şeyin eni istiqamətində (*uzununa* əksi). *Parçanı eninə kəsmək.*

◊ **Eninə-uzununa ölçmək** – boş-boşuna, məqsədsiz gəzmək, dolaşmaq, veyillənmək. *Küçəni eninə-uzununa ölçmək. Həyəti eninə-uzununa ölçmək.*

**ENİŞ** *is.* Getdikcə aşağıya enən yer; yuxarıdan aşağıya mail yer (*yoxuş* əksi). *Dəvəyə dedilər*: *– Eniş yaxşıdır, yoxuş? Dedi*: *– Lənət hər ikisinə.* (Ata. sözü). [Usta Ağabalanın] g*etdikcə gözünün qabağından küçəyə tərəf pəncərəsiz evlər, sınıq-sökük divarlar, dar eniş və yoxuş küçələr bir-bir gəlib keçirdi.* Çəmənzəminli. *Cavan çobanlardan biri Qumru ilə qarını enişə qədər ötürdü.* Ə.Məmmədxanlı.

**ENİŞAŞAĞI** *zərf.* Hündür bir yerin başından ətəyinə doğru, yuxarıdan aşağıya, üzüaşağı. *Təpəni enişaşağı düşmək. İri daşları enişaşağı yuvarlatmaq.*

**ENİŞLİ** *sif.* Eniş olan. *Enişli təpə. Enişli yol. – Başı qarlı Qafqaz sıra dağlarının qoynunda, dörd tərəfi enişli bir təpənin üstündə salınmış* [Xınalıq kəndi] *ilk baxışda üst-üstə qurulmuş qartal yuvalarını xatırladır.* R.Rza.

**ENİŞLİK** *is.* 1. Eniş yer. *Atlar enişliyə çıxdılar.*

2. Eniş yerin vəziyyəti.

**ENİŞLİ-YOXUŞLU** *sif.* 1. Enişi-yoxuşu çox olan. *Enişli-yoxuşlu cığır. Enişli-yoxuşlu yer. Enişli-yoxuşlu yol.*

2. *məc.* Əzablı, əziyyətli; əzabla, çətinliklərlə dolu. *Həyat enişli-yoxuşludur.*

**ENİŞ-YOXUŞ** *is.* Eniş və yoxuş yer. *Yenə könlüm quşu; Dönmüş ovçu tərlana; Duymaz eniş-yoxuşu; Qanad çalır hər yana.* A.Şaiq. // Sif. mənasında. *..Ağıryüklü fayton əyri-üyrü və eniş-yoxuş yollara çatdıqda bir döngədə aşıb, oxu və çarxı sındı.* S.S.*Axundov.* // *Zərf mənasında.* Aşağı-yuxarı, hər tərəf mənasında. O *qayıdıb bazara yönəldi. Bazarı eniş-yoxuş gəzdi.* S.Rəhimov.

**ENİŞ-YOXUŞLU** b a x **enişli-yoxuşlu**. *Eniş-yoxuşludur getdiyi yoltək; Bu yolu sinənlə açasan gərək.* B.Vahabzadə.

**ENLƏNMƏ** "Enlənmək"dən *f.is.*

**ENLƏNMƏK** *f.* 1. Eninə böyümək, genəlmək. *Jaket geyiləndən sonra enlənib.*

2. Enə vermək, eninə artmaq. *Bunu qırıb atdıqda pambıq gücü uzanmağa yox, enlənməyə verir.* Ə.Vəliyev.

3. Genişlənmək, yayılmaq, artmaq. *Duman enlənib hər tərəfi tutdu.*

4. *məc.* Kökəlmək. *Yaşadıqca cavanlana, enlənə; Bir hicabda, bir pərdədə əylənə.* M.P.Vaqif.

5. *məc.* Yayılmaq, yayılıb oturmaq. *..Qıssa, turşumuş xəmir kimi enlənib oturur.* Mir Cəlal.

6. *məc.* Şadlanmaq, sevinmək, məmnun olmaq. *Bitərəflər sıralardan bir-bir dartınıb iclası tərk etdikcə Mehdiqulu enlənir, şişirdi.* Mir Cəlal.

**ENLƏŞMƏ** "Enləşmək"dən *f.is.*

**ENLƏŞMƏK** *f.* Daha da enli olmaq, enlənmək.

**ENLƏTMƏ** "Enlətmək"dən *f.is.*

**ENLƏTMƏK** *f.* Daha enli etmək, en istiqamətində uzatmaq, genişləndirmək, böyütmək, genəltmək. *Yolu enlətmək. Otağı enlətmək. – Yaz və yay aylarında qamışlar yaşıl yarpaqlarını nə qədər enlətsə də, başlarını nə qədər qəlbi tutsalar da, Qara təpədən yuxarı qalxa bilmirlər.* Ə.Vəliyev.

**ENLİ** *sif.* En cəhətdən geniş olan, köndələni uzun olan, geniş. *Enli yol. Enli parça. Enli palaz. – ..İkinci məhəlləyə gəlincə, küçələri enli, təmiz və evləri səliqə ilə tikilmişdi.* N.Nərimanov. [Dərviş:] *Göy ot döşəyim, qara daş yastığım, enli yarpaqlar*

*yorğanım idi.* A.Divanbəyoğlu. *Surxay enli kürəyini bir az da dikəltdi.* M.İbrahimov.

**enli**... Enli sözü ilə bağlı olan bir sıra mürəkkəb isimlərin birinci tərkib hissəsi; məs.: enliağız, enlibaş, enlidöş, enlikürək, enlisifət.

**ENLİAĞIZ(LI)** *sif.* Ağzı enli olan, ağzı yekə. *Enliağız bıçaq. Enliağızlı balta.*

**ENLİBAŞ** *is. zool.* Çəkikimilər fəsiləsinə daxil olan enli və kök başlı şirin su balığı.

**ENLİBURUN(LU)** *sif.* Burun hissəsi enli olan. *Enliburun çəkmə.*

**ENLİCƏ** *sif.* Enli. *Ay yeznə, ürək yeznə; Enlicə kürək yeznə; Oğlu, qızı içində; Evində gərək yeznə.* (Bayatı).

**ENLİDÖŞ(LÜ)** *sif.* Döşü enli, sinəsi geniş olan. *Enlidöş adam. Enlidöşlü at.*

**ENLİK** b a x **en²**.

**ENLİKƏNAR** *sif.* Kənarı enli olan. *Enlikənar şlyapa.*

**ENLİKÜRƏK(Lİ)** *sif.* Kürəyi enli olan. *Enlikürək adam.* – [Dəli Həsən] *baxdı ki, bu* [atlı] *əynində çuxa, ayağında bağdadı başmaq, başında tirmə şal, enlikürək, qarnıyoğun bir kişi idi.* "Koroğlu". *Səkinə iftixar dolu gözlərlə .. enlikürək, ucaboylu, çatmaqaşlı və qartalgözlü oğlunu süzdü.* M.İbrahimov. [Dirsə xan] *yaşına görə boylu, enlikürəkli, qarayanız bir oğlandı.* M.Rzaquluzadə.

**ENLİQAŞ(LI)** *sif.* 1. Qaşları enli, qalın, sıxtüklü olan; qalınqaş. *Enliqaş oğlan.*

2. Qaşı böyük, enli olan. *Enliqaş üzük.* – [Budaq:] *Zəhləm gedən qırxılmış bığları, çeçələ barmağına enliqaş üzük taxması idi.* Ə.Vəliyev.

**ENLİLİK** *is.* Enli şeyin halı. *Parçanın enliliyi. Yolun enliliyi.*

**ENLİSİFƏT(Lİ)** *sif.* Sifəti enli, dolğun olan. *Enlisifət qız. Enlisifət uşaq.* – *Qabağa çıxanların arasında ortaboy, enlisifət bir qadın vardı.* Mir Cəlal.

**ENLİÜZ(LÜ)** b a x **enlisifət(li)**. *Həsən gödəkboy, enliüz, qaraqaş, qaragöz bir oğlan idi.* Ə.Sadıq.

**ENLİYARPAQ(LI)** *sif.* Yarpaqları enli olan. *Enliyarpaq ağac. Enliyarpaqlı kollar.* – *Cavan enliyarpaq əncir ağacının altına çəkilib, suyu qocanın əlindən aldı.* Mir Cəlal. *Azərbaycanda olan meşələrin, demək olar ki, hamısı enliyarpaq ağac növlərindən ibarətdir.* M.Qaşqay.

**ENMƏ** "Enmək"dən *f.is.*

**ENMƏK** *f.* 1. Yuxarıdan və ya bir şeyin üstündən aşağı düşmək. *Dağdan enmək. Zirzəmiyə enmə. Mal-qara dağdan enir.* – [Usta Ağabala] *pillələrlə aşağı endi.* Çəmənzəminli. *Mahirə mal damının üstündən cəld aşağı endi.* M.Hüseyn. // Düşmək. *Təpənin dibindən bulağın üstünə endim, əl və üzümü yuyub qaynağın qırağında oturdum.* A.Divanbəyoğlu. *Sabah erkən alaçığın ağzında oynayırdıq. Kənd uşaqları əllərində badya, mis kasa dərəyə enirdilər.* A.Şaiq.

2. Azalmaq, alçalmaq, düşmək. *Havanın temperaturu endi. Qiymətlər xeyli enmişdir.*

3. Torpağa, yerə oturmaq, yerə düşmək. *Paraşütçülərdən biri Kamalın durduğu təpədən 2-3 yüz addım aralı, məxmər otların üzərinə endi.* M.Rzaquluzadə. *Endi qəhrəmanım səmadan yerə; Çıxdı kabinədən, daldı göylərə.* M.Rahim.

4. Çevrilmək, ...halını almaq. *Çəpiklər çırtığa enmişdi; bunun da səsi eşidilmirdi.* Çəmənzəminli.

5. Çökmək, basmaq, çulğalamaq. *Sakit Azərbaycan kəndi üzərinə bir yaz axşamı enirdi.* Ə.Məmmədxanlı. *Yollardan qalxan toz uçub dağılmır, narın-narın seyrəlir, axşamın zəfəran rənginə boyanıb, zərif bürüncək tək enə-enə* (z.) *yerin üzərinə enirdi.* Ə.Əbülhəsən.

6. *məc.* Azaltmaq, aşağı salmaq. [Ələmdar:] *..Görəsən, şişbığ cavahiratın qiymətindən bircə pillə enərmi?* S.Rəhimov.

7. Dəymək, zərbə hiss etmək. *Başına bir yumruq endi.* – [Qadın] *sol əlini başının qarşısına tutmaqla, özünü üzərinə enməkdə olan ağacdan mühafizəyə çalışırdı.* S.Hüseyn.

8. *məc.* Baş əymək, tabe olmaq, ...qabağında əyilmək. *Nəbiyəm, enmərəm sultana, xana; Düşmənin tənəsi kar etməz cana; Boz atı oynadıb girrəm meydana.* "Qaçaq Nəbi".

9. **Enib-qalxmaq** şəklində: əyilib-düzəlmək, əyilərək qalxmaq, dalğalanmaq. *Şükufələnmiş güllər nəsimin dəyməsindən enib-qalxdıqca Gülsümün vidasına cavabən: "Get, Allah səni xoşbəxt eləsin!" – deyirdilər.* Ə.Haqverdiyev.

**ENSEFALÍT** [*yun.*] *tib.* Beynin iltihabı.

**ENSİKLOPEDÍK** *sif.* [*fr.*] 1. Ensiklopediya mahiyyətində olan. *Ensiklopedik lüğət.* 2. Elmin bir çox sahələrini əhatə edən; hər şeyi qavrayan, çoxcəhətli. *Ensiklopedik məlumat. Ensiklopedik bilik.*

**ENSİKLOPEDÍST** [*fr.*] 1. *kit.* Hərtərəfli məlumatı, təhsili olan adam. 2. *tar.* XVIII əsrin axırlarında Fransada nəşr edilən "Ensiklopediya" ətrafında toplaşmış qabaqcıl mütəfəkkirlər qrupunun nümayəndəsi, yaxud onların fikrinə şərik olan adam.

**ENSİKLOPÉDİYA** *is.* [*fr.* əsli *yun.*] Biliyin bütün, yaxud ayrı-ayrı sahələrinə dair lüğət şəklində sistemə salınmış məlumatlar toplusu; qamus. *Azərbaycan milli ensiklopediyası. Tibb ensiklopediyası.* // *məc.* Həyatı geniş və hərtərəfli əks etdirən bədii əsər haqqında.

◊ **Canlı ensiklopediya** – hər şeydən məlumat verə bilən, hər şey haqqında müraciət edilə bilən adam haqqında.

**ENSİKLOPEDİYAÇI** bax **ensiklopedist** 2-ci mənada. *Axı, o dövr Didro başda olmaqla Fransada məşhur ensiklopediyaçıların humanizm, azadlıq, bəşəriyyətçilik bayrağını ucaltdığı dövrdür.* M.İbrahimov.

**ENSİKLOPEDÍZM** [*fr.*] *kit.* Geniş, hərtərəfli məlumat, təhsil.

**ENSİZ** *sif.* Eni az olan, dar. *Ensiz küçə. Ensiz parça. Ensiz səki.* – [Məşuqə] *..ensiz cığırla birbaş buraya yüyürdü.* S.Rəhimov. *Ortada uzun, lakin ensiz ayaqaltı xalça salınmışdı.* M.İbrahimov. [Tahir] *dördkünc balaca kabinetə keçib dənizə tərəf baxan ensiz, uzun otağa girdi.* M.Hüseyn.

**ENSİZLƏŞDİRİLMƏ** "Ensizləşdirilmək"dən *f.is.*

**ENSİZLƏŞDİRİLMƏK** *məch.* Ensiz hala salınmaq, eni azaldılmaq, darlaşdırılmaq.

**ENSİZLƏŞDİRMƏ** "Ensizləşdirmək"dən *f.is.*

**ENSİZLƏŞDİRMƏK** *f.* Ensiz hala salmaq, eninə azaltmaq, darlaşdırmaq.

**ENSİZLƏŞMƏ** "Ensizləşmək"dən *f.is.*

**ENSİZLƏŞMƏK** *f.* Getdikcə daralmaq, ensiz olmaq. *Yol getdikcə ensizləşirdi.*

**ENSİZLİK** *is.* Ensiz şeyin halı; en cəhətdən darlıq.

**ENTOMÓLOQ** [*yun.* entoma – həşəratlar və logos – elm] Entomologiya mütəxəssisi. *Axmazın yanında Sultanov entomoloq həkimi ilə görüşdü.* Ə.Sadıq. *XX əsrin əvvəlində həvəskar entomoloq Avropadan Amerikaya zərərsiz bir kəpənək tək baramaqurdu gətirmişdi.* (Qəzetlərdən).

**ENTOMOLÓGİYA** [*yun.*] Zoologiyanın həşərat (böcəklər) bəhsi.

**ENTOMOLOJÍ** *sif.* [*yun.*] Entomologiyaya aid. *Entomoloji tədqiqat.*

**ENTUZİÁST** [*yun.*] Bütün qüvvəsi ilə, böyük şövq və həvəslə işləyən adam. // Bütün qüvvə və həvəsini bir işə verən, bir şeyin coşqun pərəstişkarı olan adam. *Doktor entuziast olduğu üçün* [qızın] *sözləri ona toxundu.* Çəmənzəminli.

**ENTUZİÁZM** [*yun.*] Böyük şövq və həvəs; vəcd.

**EOLİT** [*yun.* eos – şəfəq və lithos – daş] *arxeol.* 1. Daş dövrünün, ən qədim ibtidai daş alətləri qayrılan mərhələsi. 2. Bu dövrə aid ibtidai daş alət.

**EPİDEMÍK** *sif.* [*yun.*] Epidemiya mahiyyətində olan; yoluxucu, yoluxma. *Epidemik xəstəliklər.* // *məc.* Epidemiya kimi hər yerə yayılmış.

**EPİDEMİOLÓGİYA** [*yun.*] Tibb elminin yoluxucu xəstəliklərin törəyib yayılması səbəblərini öyrənən və onların qarşısını almaq üsullarından bəhs edən sahəsi.

**EPİDEMİÓLOQ** [*yun.*] Epidemiologiya mütəxəssisi.

**EPİDÉMİYA** [*yun*] *tib.* Hər hansı bir yoluxucu xəstəliyin geniş yayılması. *Tif epidemiyası. Vəba epidemiyası.* – *Hərgah bir yerdə epidemiya varsa, həkimlərimizdən tələb edirik ki, tezliklə bunun qarşısını alsınlar.* Ü.Hacıbəyov. // *məc.* Çox tez və geniş yayılan hər hansı bir şey haqqında.

**ÉPİK** *is.* [*yun.*] Epik əsərlər müəllifi.

**EPÍK²** *sif.* [*yun.*] *ədəb.* Eposa aid, epos xüsusiyyətli. *Epik əsərlər. Epik dastanlar.*

**ÉPİKA** [*yun.*] *ədəb.* Epik əsərlər.

**EPİKLİK** *is.* Epik xüsusiyyət daşıma. *Diskussiyanın gedişində romanın inkişaf etdirilməsinin mühüm məsələləri, onun forma və kompozisiyası, epiklik, tarixilik və*

*xəlqilik məsələləri .. müzakirə edilmişdir.* (Qəzetlərdən).

**EPİKRİZ** *is.* [*yun.*] Xəstəliklə bağlı yekun nəticə, qərar.

**EPİKÜRİZM** bax **epikürçülük**. *Əsrlərdən bəri mistik dona geydirilmiş platonik eşqə qarşı poeziyada bir növ epikürizm gəlir.* M.İbrahimov.

**EPİKÜRÇÜ** *is.* 1. Epikür fəlsəfəsi tərəfdarı.

2. *məc. kit.* Zövq və nəşəni hər şeydən üstün tutan adam; kefcil, işrətpərəst. *Epikürçü şair* [Abdulla bəy Asi] *şeirlərinin birində deyir*: *"Bir halda ki, şərab vaizlərin moizəsindən daha yaxşı insanın beynini işıqlandırır, necə ola bilər ki, belə bir şərabı içməyəsən?"* F.Köçərli.

**EPİKÜRÇÜLÜK** *is.* 1. Qədim yunan materialist filosofu və ateisti Epikürün fəlsəfi nəzəriyyəsi.

2. *kit.* Həmin nəzəriyyədən yanlış nəticə çıxaran, həyatın mənasını kefdə, eyş-işrətdə, rahat həyatda görən dünyagörüşü.

3. *məc. kit.* Eyş-işrətə, kefə, ləzzətli həyata meyil.

**EPİQÓN** [*yun.*] Özünün müstəqil yaradıcılıq siması olmayıb, hər hansı bir siyasi, ədəbi, elmi və başqa cərəyanı təqlid edən yazıçı, alim və b.; təqlidçi. *Epiqon ədəbiyyatı.*

**EPİQONLUQ** *is.* Elmdə, siyasətdə, incəsənətdə və s.-də təqlidçilik. *..XIX əsrin ortalarında bütün Yaxın Şərq ədəbiyyatında belə bir vəziyyət əmələ gəlmişdi ki, keçmişdə ölməz nümunələr yaratmış Nizami, Firdovsi, Nəvai və Füzuli kimi şəxsiyyətlərin bədii yaradıcılığından tərbiyə almış adamlara başdan-başa epiqonluqdan ibarət olan əsərlər təqdim edirdilər.* M.Hüseyn. *Hökmdarlar məclisində oxuyan xanəndə qız obrazı isə "Koroğlu"dan sonra bəzi başqa operalara da daxil edilmişdir ki, bu da adi epiqonluqdur.* Ə.Bədəlbəyli.

**EPÍQRAF** [*yun.* epigraphe – yazı] 1. Qədim yunanlarda: abidə üzərində yazı.

2. *ədəb.* Əsərin və ya onun bölmələrinin başlıqlarından sonra yazılan sözlər; zərbi-məsəl, hikmətli söz. *C.Məmmədquluzadə Qoqoldan öyrəndiyini və onu öz böyük müəllimi kimi hədsiz bir məhəbbətlə sevdiyini fəxrlə söyləyir və hətta .. "Qurbanəli bəy" adlı məşhur hekayəsinin "Allah sənə rəhmət eləsin, Qoqol!" epiqrafı ilə də bunu təsdiq edir.* M.Hüseyn.

**EPİQRAFİK** *sif.* [*yun.*] Epiqrafikaya aid olan, epiqrafika xarakterində olan. *Epiqrafik mətn. Epiqrafik material.*

**EPİQRÁFİKA** [*yun.*] Epiqraflar haqqında elm.

**EPİQRÁM** [*yun.* epigramma – yazı] 1. Qədim yunanlarda: abidələr, binalar, hədiyyələr və s. üzərində yazılan yadigarlıq yazı. *Feokritin zəngin ədəbi irsindən ancaq bir şeir külliyyatı qalmışdır ki, o da otuz idilliyadan və iyirmi üç epiqramdan ibarətdir.* Ə.Sultanlı.

2. *ədəb.* Kiçik satirik şeir; həcv. [Silvio:] *..Mənim epiqramlarıma epiqramlarla cavab verirdi,* [qrafın] *bu cavabları mənə həmişə daha gözlənilməz, daha kəskin görünürdü..* A.Puşkindən.

**EPİLÉPSİYA** [*yun.* epilepsia – özündən getmə] *tib.* Vaxtaşırı və qəflətən bərk qıcolma və özündəngetmə şəklində cərəyan edən xroniki sinir xəstəliyi. *Epilepsiya tutmaları. Epilepsiyanın diaqnozu.*

**EPİLÉPTİK** [*yun.*] Epileptik xəstəliyi olan adam. *Epileptiklərin xasiyyəti get-gedə dəyişir. – O, "uşaqları gözləyin, uşaqları gözləyin", – deyə-deyə epileptik adamlar kimi yerə dəydi.* M.İbrahimov.

**EPİLÓQ** [*yun.*] Ədəbi əsərin son hissəsi. // Operada son pərdə. *Opera təntənəli epiloqla bitir.* // Son, nəticə, xatimə. *Üsyanın epiloqu.*

**EPİSÉNTR** [*yun.* epi – üstündə, yanında və *lat.* sentr – mərkəz] Zəlzələ mərkəzi; Yer səthinin bilavasitə zəlzələ mənbəyi üzərində olan sahəsi. *Zəlzələnin episentri.*

**EPİSTOLYÁR** *sif.* [*lat.*] *ədəb.* 1. Məktub şəklində yazılmış. *Epistolyar roman.*

2. Bir yazıçının, şairin məktublar məcmusu. *Puşkinin epistolyar irsi.*

**EPÍTET** [*yun.*] *ədəb.* Məcazın növlərindən biri olub, bir sözü qüvvətləndirmək və zənginləşdirmək, xassə vermək üçün əlavə edilən söz (məs.: mələk simalı, polad canlı).

**EPİZÓD** [*yun.* epeisodion – əlavə] 1. Hadisə, əhvalat, təsadüf, ittifaq, vəqə. *Əsgər-*

*lər yana-yana Qələndərdən danışırdılar və kim hansı epizodu nağıl edirdisə, sözünün axırını gətirib Qələndərlə bağlayırdı.* Ə.Əbülhəsən.

2. Bədii əsərin bitmiş, müstəqil olan bir parçası. *Romandan bir epizod danışdı.* // *kit.* Hadisələr silsiləsi içində bir vəqə. *Əhvalatın ən romantik və dramatik epizodu.* // Kinoşəklinin məzmunca bitmiş hissəsi. *Bu epizod filmin ən güclü parçasıdır.* // Teatr tamaşasında əhvalatın inkişafı ilə bağlı olmayan səhnə, pərdə. *Baletin dərin humanist ideyası öz ifadəsini həm kütləvi qəhrəmanlıq səhnələrində, həm lirik adajiolarda, həm də rəqs epizodlarında tapır.* (Qəzetlərdən).

**EPİZODİ́K** *sif.* [*yun.*] 1. Sistematik xarakter daşımayan, təsadüfdən-təsadüfə olan. *Epizodik kömək. İşin gedişinin epizodik yoxlanması.*

2. Yalnız ayrı-ayrı səhnələrdə, epizodlarda görünən, daimi olmayan. *Epizodik surətlər. Epizodik rollar.*

**EPİZODİKLİK** *is.* Epizodik xasiyyət daşıma. *Romanda hadisələrin epizodikliyi. Tamaşada rolun epizodikliyi.*

**EPOLÉT** [*fr.*] Fərqlənmə nişanları olan, qızıl və ya gümüş bafta, saçaq və s. ilə bəzədilmiş, bir tərəfi girdə, xüsusi formalı paqon; 1917-ci ilədək Rusiyada zabit rütbəsinin nişanı.

**EPOLETLİ** *sif.* Çiyinlərində epolet olan. *Epoletli zabit şineli.*

**EPÓNJ** [*fr.*] Xüsusi formada eşilmiş saplardan diş-diş parça növü. *Eponj .. fasonlu saplardan toxunduğu üçün çox bəzəkli toxunma hesab olunur.*

**ÉPOS** [*yun.*] Rəvayət səciyyəvi ədəbiyyat, dastan. *Koroğlu eposu. Qəhrəmanlıq eposu.* // Qəhrəmannamələr, dastanlar və s. xalq yaradıcılığı əsərlərinin məcmusu. *Qırğızların "Manas" eposu.*

**ER** "R" hərfinin adı.

**ERA** [*lat.*] 1. İl hesabının başlandığı zaman, tarix başlanğıcı. *Yeni era* (İsanın doğulduğu zənn edilən gündən başlanan tarix). – *Ellips, parabola kimi həndəsi obrazlar 2000 il eramızdan əvvəl yunan riyaziyyatçılarına məlum idi.* Z.Xəlilov.

2. *kit.* Böyük tarixi əhəmiyyəti olan dövr. *İslam mədəniyyətinin meydana gəlməsi ilə bəşəriyyət mənəviyyatı tarixində yeni bir era açıldı.*

3. *geol.* Yer tarixinin ən böyük xronoloji bölgüsü. *Yerin Günəşdən ayrıldığı vaxtdan etibarən keçirdiyi tarix müxtəlif era və dövrlərə ayrılır.* M.Qaşqay.

**ER-GEC** *zərf* Tez-gec. [Ağsaçlı qadın Səyavuşa:] *Quzum! Er-gec parlar adın cahanda; Diz çökərlər sana qarşı hər yanda.* H.Cavid.

**ERİŞMƏK** b a x **ermək**. [Rəsul:] *Cümə axşamında, cümə günündə; Ərənlər erişdi nəzərgah mənim.* "Aşıq Qərib". *Ahü zar kəsibdir səbrü qərarım; Erişir fələyə naləvü zarım.* Aşıq Paşa.

**ERİTROSİTLƏR** *cəm* [*yun.* erythros – qırmızı və kytos – hüceyrə] *fiziol.* Qırmızı qan cisimcikləri.

**ÉRKER** [*alm.*] *arxit.* Binanın daxilini genişləndirən və bir neçə mərtəbədən keçən divarında pəncərələri olan yarımdairə və ya tin-tin şəklində çıxıntı.

**ERKƏC** *is.* Erkək keçi, təkə. *Sürünün qabağında uzunqəzilli, dik burmabuynuzlu, ala erkəc başını yerə əyir*(*di*). S.Rəhimov. *Qoyunlar güneylərdə gərnəşir, keçilər həmərsin kollarının başını dişləyir, boynu qumrovlu erkəclər arabir səs eləyir.* Ə.Vəliyev.

**ERKƏK** *sif.* 1. Kişi cinsinə mənsub fərd. *Erkək at. Erkək arı.* – *Aslanın erkəyi, dişisi olmaz.* (Ata. sözü). *Ağacların arasından qəfildən oldu əyan; Yaraqlı erkək at üstündə bir neçə oğlan.* A.Səhhət. *Rəhmətlik atam Güloğlan anamı o qədər qısqanırdı ki, evdə nə erkək qoyun, nə də xoruz saxlardı.* M.S.Ordubadi. *Dəstənin üç baş inəyi, beş-altı erkək danası, səkkizə qədər də atı vardı.* M.Hüseyn. // *is.* Erkək qoyun, qoç. *Erkək kəsib, ağır məclis qururdu; Şülən çəkilirdi malların, dağlar!* Aşıq Ələsgər. *Cəmisi bir neçə gün əvvəl birinci dəfə Qarabağdan Bakıya gələn Gəray ağa, Cavanşirin mətbəxi üçün təzə erkək əti, şit yağ, əla düyü gətirmişdi.* S.Rəhimov.

2. *is.* Kişi mənasında. *Fisqü-fücur həddən aşıb Şişədə; Erkəyi, dişisi yaman peşədə.* Q.Zakir. *Şən balalar, dağ gövdəli erkək-*

*lər; Gözəl qızlar, qara tellər bizimdir.* A.Şaiq. ..*Qadın və erkəklər məhkəmə salonunda deyil, məhkəmə binası qarşısında durmaq məcburiyyətində qalmışlardı.* T.Ş.Simurq.

3. *məc. sif.* Kişi kimi möhkəm, güclü. [Ceyran] *istehsalatda çalışan erkək ruhlu, gülərüzlü bir yoldaş idi.* S.Hüseyn.

4. *məc.* Qaba, kobud, nəzakətsiz mənasında. *Erkək zarafatı eləmək.*

◊ **Erkək Tükəzban** – kişi təbiətli, özünü kişi kimi aparan, kişi ədalı, bir qədər qaba qadın haqqında.

**ERKƏKCƏ** *sif.* və *zərf* Kişi kimi, mərdcəsinə, cəsuranə. [1-ci mürəttib:] ..*Yalnız erkəkcə mətanət lazım... Yoxsa, həşərat kimi üzü üstə süründükcə əsla ağ gün görməyəcəyik.* H.Cavid.

**ERKƏKCİK** *is. bot.* Bitki çiçəklərinin erkək döllüyünün adı. *Biz botanika kursundan bilirik ki, armudun çiçəklərində həm erkəkciklər, həm də dişiciklər olur.* M.Axundov.

**ERKƏKLƏMƏK** *f. məh.* 1. Həddi-büluğa çataraq səsi yoğunlaşmaq, qabalaşmaq (oğlan uşağı haqqında).

2. *məh.* Vaxtında dərilmədiyindən ötmək, kobudlaşmaq, bərk olmaq (bitkilər haqqında).

**ERKƏKLƏNMƏ** "Erkəklənmək"dən *f.is.*

**ERKƏKLƏNMƏK** 1. B a x **erkəkləşmək**.

2. Kişilənmək, yekələnmək.

**ERKƏKLƏŞMƏ** "Erkəkləşmək"dən *f.is.*

**ERKƏKLƏŞMƏK** *f.* 1. Kişi xasiyyəti almaq, kişi kimi olmaq (qadın haqqında).

2. *məc. dan.* Kobudlaşmaq, qabalaşmaq.

**ERKƏKLİK** *is.* 1. Erkək insan və ya heyvanın hal və sifəti.

2. Yaşa dolma, həddi-büluğa çatma, yetkinlik.

3. *dan.* Qabalıq, kobudluq, qanmazlıq, tərbiyəsizlik. *Erkəkliyinə salmaq* (*qabalıq etmək, qanmazcasına hərəkət etmək*).

**ERKƏN** *zərf.* 1. Səhər tezdən, sübhdən, ertə. *Erkən yola düşmək. Erkən durmaq.* – *Qara .. hər səhər erkən evə gəlib qarıya baş çəkərdi.* Ə.Əbülhəsən. *Maya yuxudan erkən qalxdı.* M.İbrahimov. [Kamil] *səhər erkən, hamıdan tez durar, .. əlüzyuyana su töküb buğlana-buğlana əl-üzünü yuyar, məktəbə gedərdi.* M.Rzaquluzadə.

2. Vaxtından əvvəl, tez. *Hacı yenə evə erkən qayıtmışdı.* A.Şaiq. *Gülpəri erkən gedib mənzilə çatmaq üçün faytonları qovdururdu.* S.S.Axundov. *Mən o sevdalı qızın; O qanadlı ulduzun; Hər halını sevərkən; Bu bəlaya lap erkən; Düşməyimi bilməzdim.* S.Vurğun.

**ERQ** [*yun.*] *fiz.* İş və enerji ölçüsü vahidi. *Erq bir dina qüvvənin* (*hərəkət istiqamətində*) *bir sm məsafədə gördüyü işdir.* "Fizika".

**ERMƏK** *f.* 1. Çatmaq, yetişmək, vasil olmaq. *Mənzilə ermək.* – *Qurbani der*: *vüsalına ermədim.* Qurbani.

2. Nail olmaq, əldə etmək, yetmək, çatmaq. *Arzusuna ermək. Muradına ermək.*

**ERMƏNİ** *is.* Ermənistan Respublikasının əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Ermənilər hind-Avropa mənşəli xalqdır, amma onların dili türk dillərinin güclü təsirinə məruz qalmışdır.* – *Erməninin qocalanı köpəyə, müsəlmanın qocalanı ipəyə dönər*. (Ata. sözü). *Ermənilərin təcavüzkarlığı hələ antik müəlliflərin diqqətini cəlb etmişdi.* "Azərbaycan tarixi". *Ermənilər həm də ikiüzlü və dəyişkəndilər,* [ölkələrinə] *gah bu, gah da başqa ordunu dəvət edirdilər.* (Roma tarixçisi K.Tasit). *Haylar .. Ərməniyyə ölkəsinə gələndən xeyli sonra .. bəzi qonşu xalqlar təbii olaraq onları artıq Ərməniyyə əhalisi (erməni) kimi tanımışlar. Ona görə də .. erməni adının mənşəyindən danışarkən vacib şərtlərdən biri sonrakı psevdo-ermənilər (haylar) ilə əsil qədim ermənilərin fərqləndirilməsidir*. F.Ağasıoğlu.

**ERMƏNİCƏ** *sif.* və *zərf.* Erməni dilində. *Ermənicə kitab. Ermənicə danışmaq.* – *Biri rusca, o biri ermənicə, bir başqası da ukraynaca oxudu.* M.Hüseyn.

**EROTİ́K** *sif.* [*yun.*] Erotikaya aid, erotika ilə dolu; şəhvani hisslər ifadə edən. *Erotik şeir.* – ..*Azərbaycan şairləri arasında əsərlərinin çoxu erotik məzmun daşıyan Dilsuz, Raci, Qumri, Dəxil və başqaları məşhurdur.* F.Köçərli.

**ERÓTİKA** [*yun.*] Eşq və şəhvani hissləri ifadə və təsirə qarşı meyil, maraq.

**ERÓZİYA** [*lat.*] 1. *geol.* Torpağın, Yer qabığının axar sular, buz və ya külək təsiri ilə

dağılması prosesi. *Axar suların yuyucu fəaliyyətinə geologiya elmində eroziya, kimyəvi fəaliyyətinə isə korroziya deyilir.* M.Qaşqay.

2. *tex.* Mexaniki təsir nəticəsində metalların pas atması. *Elektrik eroziyası elektrodlar arasında yaranan elektrik boşalması təsiri ilə materialın müəyyən istiqamətində bir elektroddan o biri elektroda köçürülməsindən ibarət olan fiziki hadisədir.* P.Rüstəmzadə.

**EROTÍZM** [*yun.*] *kit.* Eşq və şəhvani məsələlərə həddindən artıq meyil, maraq. *..Saraydan və yüksək vəzifəli şəxslərin diqqətindən uzaqda olan şairlər isə öz əsərlərinə yeni bir ünsür olaraq erotizmi daxil edirdilər.* F.Köçərli.

**ERTƏ** *zərf* 1. Sübhdən, tezdən, səhər tezdən, erkən, erkəndən. *Ertə durmaq. Səhər ertədən işləmək. – Sübh çox ertə oyanardı qarı; Durğuzar idi hamı xidmətkarı.* A.Səhhət. *Qurbanqulu çox işsevən bir cavan idi. Sübh hamı qonşularından ertə durub oduna, biçinə, alağa, xıra, bağa gedərdi.* T.Ş.Simurq.

2. Hazırkı gündən sonra gələn gün, dal gün, o birisi gün. *Ertəyə qalan, arxaya qalar.* (Ata. sözü).

3. Daha tez, daha erkən. *Bu gün ertə durdu.* // Tez, qabaq, vaxtından əvvəl. *Şəhərə bir azca ertə çatmaq üçün; Tələsirdi qabaqca satmaq üçün.* A.Səhhət.

**ERTƏDƏN** *zərf.* Tezdən, sübhdən, erkən. *Ertədən işini görüb qurtarmaq. – Nəbi ertədən öz səngərini möhkəmlətmişdi.* "Qaçaq Nəbi". *Lotubaşı ertədən yolu bələdləyib xəzinənin yarılmasını axşama qoydu.* "Aşıq Qərib".

**ERTƏLƏMƏK** *f* 1. Ertə günə qoymaq.

2. Başqa zamana buraxmaq.

**ERTƏSİ** *zərf.* Bir günün, həftənin, ayın, ilin ardınca gələn gün, həftə, ay, il. *Bayramın ertəsi yola düşdülər. Ertəsi gün işə başladılar.* – [Qorxmaz:] *Ertəsi gün isə aldığın son bir parça çörəyi özün yeməyib, dünən sənə daş atan qocaya verdin.* C.Cabbarlı. *Nə isə ertəsi gün səhər saat yeddinin yarısında işə başladıq.* Çəmənzəminli.

**ESÉR** ["sosialist-revolyusioner" sözlərinin ixtisar edilmiş baş hərflərinin adından] *tar. siyasi.* b a x **sosialist-revolyusioner**.

**ESÉS** [*alm.* SS (mühafizə dəstəsi) ixtisarı] Alman-faşist mühafizə dəstələri və ya faşist-alman ordusunun xüsusi hissələri.

**ESESÇİ** *is.* Eses dəstələrində və ya hissələrində xidmət edən adam.

**ESKÁDRA** [*fr.*] Hərbi dəniz, ya hava flotu gəmilərinin böyük birləşməsi.

**ESKADRÍLYA** [*fr.*] Bir neçə təyyarə dəstəsindən ibarət olan hərbi aviasiya. *Bombardmançı eskadrilya.*

**ESKADRÓN** [*fr.*] Piyada qoşundakı rotaya bərabər süvari qoşun hissəsi. *Buna görə də onu Seyidhəmzə ziyarətgahından çıxarmaq üçün bir eskadron kazak göndərildi.* M.S.Ordubadi.

**ESKALÁTOR** [*ing.*] Adamları qaldırıb-endirmək üçün durmadan hərəkət edən pilləkən. *Biletlərimizi hərəkətedici pilləkənlər* (*eskalator*) *başında durmuş milisionerə göstərərək, ayaqlarımızı ilk pilləyə basırıq və pilləkən tez bizi götürüb gedir.* Ə.Məmmədxanlı.

**ESKİMÓ** [*fr.*] Üstü şokoladlı dondurma.

**ESKİMÓS** Şimali Amerikanın qütb sahilində, Qrenlandiyada və Asiyanın şimal-şərq qurtaracağında yaşayan xalq və bu xalqa mənsub adam.

**ESKÍZ** [*fr.*] 1. Bir şəklin, rəsmin və ya onun bir hissəsinin ilk qaralaması. // Heykəltəraşlıq əsərinin kiçildilmiş miqyasda hazırlanan ilk nümunəsi, modeli, taslağı. // Bir musiqi əsərinin, ədəbi əsərin və ya onların hissələrinin ilk redaktəsi. *Süita şəklində yazılmış çoxhissəli musiqi əsərlərinə bəzən "eskiz" və ya "etüd" adı da verilir.* Ə.Bədəlbəyli.

2. Bir şeyi düzəltmək üçün nümunə, əsas olan şəkil və s. *Paltarların eskizi. Dekorasiya eskizi.*

**ESMÍNES** [*rus.* "эскадренный миноносец" sözlərinin ixtisarı] **Minadaşıyan eskadra gəmisi.** *Odessada o yaralanandan iki gün əvvəl həmin esminesdə onun atası həlak olmuşdu.* Ə.Əbülhəsən.

**ESPERANTÍST** [*fr.*] b a x **esperantoçu**.

**ESPERÁNTO** [*fr.*] Ən çox yayılmış Avropa dilləri materialı əsasında düzəldilmiş süni beynəlxalq dil.

**ESPERANTOÇU** *is.* Esperanto dilindən istifadə və onu təbliğ edən adam.

**ESSE** *is.* [*fr.* essai – təcrübə, sınaq, oçerk] Problemi sərbəst şəkildə şərh edən kiçik həcmli əsər.

**ESTAFÉT** [*fr.* əsli *ital.*] *idm.* Komandaların qaçış, üzgü və s. yarışı (bu yarışda iştirakçılar müəyyən mənzillərdə bir-birini əvəz edir və bir-birinə müəyyən şey ötürürlər). // Bu yarış zamanı yarışçıların mənzillərdə bir-birinə ötürdükləri şey. [İdmançının] *əlində estafet ağacı vardır.* (Qəzetlərdən).

**ESTAKÁDA** *is.* [*fr.*] Hərəkət çox olan yerlərdə nəqliyyatın hərəkətini, gəmilərin yan almasını, yaxud yükləmə və boşaltma işlərini yüngülləşdirmək üçün körpü şəklində qurğu. // Dənizin dibindən neft və qaz çıxarmaq üçün üzərində neft buruqları və s. təsisat qurulan metal dirəklər üzərində dayanan uzun və böyük körpü. *Neft Bakısı üçün səciyyəvi olan sənaye mənzərəsi – dənizi yarıb keçən polad estakadalar, .. ayrı-ayrı buruqların yerləşdiyi süni adalar əlcəzairli qonaqları valeh etmişdir.* (Qəzetlərdən).

**ESTÉT** [*yun.*] Gözəllik, bədiilik pərəstişkarı, estetizmə mail olan, estetizm tərəfdarı.

**ESTETCƏSİNƏ** *zərf.* Estet kimi, estetə xas, estetizm mövqeyindən. *Məsələyə estetcəsinə yanaşmaq.*

**ESTETÇİ** b a x **estetik** 1-ci mənada. [C.Cabbarlı] *formalist və estetçi yazıçıları tənqid edərək yazırdı.* M.Arif.

**ESTETÇİLİK** b a x **estetizm**. *Lakin* [Cabbarlının dramaları] *estetçilikdən, formalizm ədabazlığından uzaqdır.* M.İbrahimov.

**ESTETÍK**[1] *is.* [*yun.*] 1. B a x **estet**.

2. *dan.* İncəsənət nəzəriyyəçisi.

**ESTETÍK**[2] *sif.* [*yun.*] Estetikaya aid olan, estetika ilə bağlı olan. *Estetik zövq. Estetik duyğu.*

**ESTÉTİKA** [*yun.* aisthetikos – duyan, həssas] 1. İncəsənət haqqında, bədii yaradıcılıqda, təbiətdə və həyatda gözəllik, gözəl formalar haqqında fəlsəfi nəzəriyyə. *Estetika tarixində alman klassik fəlsəfəsinin xüsusi rolu olmuşdur.* // Bir şəxsin incəsənət və ya onun hər hansı bir növü haqqındakı görüşləri. *M.F.Axundzadənin estetikası.*

2. Gözəllik, bədiilik.

**ESTETÍZM** [*yun.*] *kit.* 1. Gözəlliyə, bədiiliyə, incəliyə pərəstişkarlıq, maillik; gözəlliyə məftunluq.

2. İncəsənətdə əsərin ideyasına, məzmununa fikir verməyib, zahiri formalara, gözəlliyə həddindən artıq meyil göstərmə; estetikada formalizm. [C.Cabbarlı] *hər cür formalizmi, estetizmi şiddətli surətdə tənqid edirdi.* M.Arif.

**ESTON** Fin-uqor dillərinin fin qrupuna daxil olan dillərdən biri və həmin dildə danışan adamın adı. *Eston dili. Eston ədəbiyyatı.*

**ESTONCA** *sif* və *zərf.* Eston dilində. *Estonca-rusca lüğət. Estonca danışmaq.*

**ESTRÁDA** [*fr.*] 1. Kütlə qabağında çıxış edən artistlər üçün tikilən açıq səhnə, taxta meydança. [Səbri] *..ürəyi bərk döyünə-döyünə estradanın yanındakı ağ məhəccərə söykənərək oğrun-oğrun tamaşaçılara baxırdı.* M.Hüseyn. *..Qədim Misirdə sehrbazlar və bu sehrbazların oyun çıxarmaları üçün müəyyən estradalar – səhnələr olmuşdur.* Ə.Haqverdiyev.

2. Estradada göstərilən, nömrələri tez-tez dəyişən konsertlərdən və s.-dən ibarət kiçik formalı tamaşa. *Estrada orkestri. Estrada nömrələri.*

**EŞ** *is.* [*türk.*] Yoldaş, dost. *Minlərcə sənin eşlərin ancaq; Yoxsulları etməkdə oyuncaq.* H.Cavid. *Sinəm başdan-başa oddur, atəşdir; Ömrüm səadətə əvvəldən eşdir.* M.Rahim.

**EŞAFOT** *is.* [*fr.*] 1. Qətli icra etmək üçün düzəldilən səhnə.

2. Dar ağacı.

**EŞDİRİLMƏ** "Eşdirilmək"dən *f.is.*

**EŞDİRİLMƏK** "Eşdirmək"dən *məch.*

**EŞDİRMƏ** "Eşdirmək"dən *f.is.*

**EŞDİRMƏK** "Eşmək"dən *icb. İpi eşdirmək.*

**EŞELÓN** [*fr.*] 1. *hərb.* Cəbhə dərinliyində və ya girintili-çıxıntılı vəziyyətdə mövqe tutan və bu qaydada yeriyən qoşun hissəsi. *Bir neçə gün idi ki, hərbi eşelonlar Qardaban-Qarayazı stansiyalarında dayanıb yol gözləyirdilər.* İ.Şıxlı.

2. *hərb.* Kütləvi surətdə minik daşıyan qoşun qatarı, əsgəri qatar. *Biz Şahtaxtıda ikən Sparskinin Təbrizə gedən son əsgəri eşelonu gəlib Culfaya getdi.* M.S.Ordubadi.

3. Ümumiyyətlə, müəyyən yerə gedən dəmiryol, yük və ya minik qatarı. *..Gətirilən taxta-dirək eşelonu bu gün Təzəşəhərə çatmışdı.* Mir Cəlal.

**EŞELONLAMA** "Eşelonlamaq"dan *f.is.*

**EŞELONLAMAQ** *f. hərb.* Eşelonlar (1-ci mənada) halında yerləşdirmək.

**EŞELONLANMA** "Eşelonlanmaq"dan *f.is.*

**EŞELONLANMAQ** *məch. hərb.* Eşelonlar halında yerləşdirilmək.

**EŞƏLƏK** *is. məh.* Alma, armud, heyva kimi meyvələrin yeyilməyən iç hissəsi.

**EŞƏLƏMƏ** "Eşələmək"dən *f.is.*

**EŞƏLƏMƏK** *f.* 1. Torpaq, kül kimi toz halında olan şeyləri bir şeylə ehmallı qazımaq, qarışdırmaq. *Kərim kişi .. tonqalın közünü eşələyərək sözə başladı..* M.İbrahimov. *Qazan xan tonqalın kənarında oturub gözünü bir nöqtəyə zilləmiş, əlindəki çubuqla külü eşələyir.* M.Rzaquluzadə.

2. Axtarmaq, araşdırmaq, əlləşdirmək, tökübtöküşdürmək, dağıtmaq. *Rüstəm bəy kitabları eşələyib bir əsər çıxardı: – Bax, bunu hər bir qadın oxumalıdır! – deyə bir kitab verdi.* Çəmənzəminli.

**EŞƏLƏNMƏ** "Eşələnmək"dən *f.is.*

**EŞƏLƏNMƏK** *qayıd.* 1. Ayaqları ilə torpağı qurdalayaraq, qazaraq özünə yem aramaq. *Cücələrim birər-birər; Suyu görüb yavuq gələr; İçər, gedər, eşələnər.* A.Səhhət. *Çadırımızın dörd bir yanı açıqlıq olduğundan toyuq cücələri ilə o açıqlıqda gəzişir, qurd-quş, çəyirtkə tutub yeyir və eşələnirdi.* A.Şaiq.

2. Yerində qurdalanmaq, o üz-bu üzə çevrilmək. [Ana:] *Səhər tezdən, lap toyuqlar ağacdan töküləndə biz oyanıb dururuq,* [oğlum] *oyanırsa da, gözü baxa-baxa yerinin içində o tərəf-bu tərəfə eşələnir.* Qantəmir. *Sübhanverdizadə eşələnərək məftilli krovatı cırıldatdı.* S.Rəhimov. *Tapdıq yerinin içində eşələndi və gözünü açdı.* Ə.Vəliyev.

**EŞƏNƏK** *is.* 1. Toyuğun qazıb açdığı, eşələyib açdığı yer, eşilmiş yer. *Toyuq eşənəyi. – Toyuğun başı kəsiləndə eşənəkdə qalar.* (Ata. sözü).

2. *məc.* Qarışdırılmış, eşələnmiş, tökübtöküşdürülmüş, qatma-qarışıq yer.

**EŞİDƏN** *is. dan.* Dinləyici, dinləyən. *Radio eşidənlər.*

**EŞİDİLMƏ** "Eşidilmək"dən *f.is.*

**EŞİDİLMƏK** *məch.* 1. Qulaq vasitəsilə qavranılmaq, qulaqla duyulmaq, qulağa çatmaq (səs haqqında). *Yuxarıda qat-qarışıq bir səs eşidildi.* A.Şaiq. *Göydə ulduz ulduzu çağırırdı.. Yaxından dənizin uğultusu eşidilirdi.* M.Hüseyn. *Birdən lap qulağının dibində eşidilən bir qışqırıq Qadiri bu xülyalarından ayırdı.* Ə.Əbülhəsən.

2. Xəbər çatmaq, xəbər alınmaq. *Bu gün təzə bir xəbər eşidildi.*

3. Dinlənilmək, qulaq asılmaq, qəbul edilmək, nəzərə alınmaq (çox vaxt inkar şəklində). *Onun bu arzusu kimsə tərəfindən eşidilmədi.*

**EŞİDİLMƏZ** *sif.* və *zərf* Eşidilməsi mümkün olmayan, eşidilməyən. [Musa kişinin] *yalnız ağzına dəsmal basdıqda səsi eşidilməz oldu.* M.İbrahimov.

**EŞİDİLMƏZLİK** *is.* Eşidilməsi mümkün olmayan səsin halı.

**EŞİK** *is.* 1. Bayır, dışarı, çöl. *Gecənin bir aləmində Nəbi evdən eşiyə çıxır.* "Qaçaq Nəbi". *Hacı Həsən bir söz deməyib gəlir, yapışır İskəndərin qolundan və çəkə-çəkə aparır eşiyə.* C.Məmmədquluzadə. [Dərviş:] *Ruqiyyə, niyə eşikdə oturubsan?* A.Divanbəyoğlu. ◻ **Eşiyə atmaq** – bayıra tullamaq, çıxarıb atmaq, tullamaq. **Eşiyə çıxmaq** – 1) üzə çıxmaq, zühura çıxmaq, aşkara çıxmaq, görünmək. *Bir müddət Cahangir dərviş paltarında tacirin evində qaldı. Bir gün öz-özünə fikir elədi ki, yaxşı, bəs mən nə vaxta kimi bu dörd divar arasından eşiyə çıxmayacağam?* (Nağıl); 2) təbii ehtiyacını rəf etmək, ayaqyoluna getmək. **Eşiyə salmaq** – qovmaq. *Həsən ağa kimi zalımın biri getdi, naçalnikdən xahiş elədi. Bir də görəcəksən, papağımı qoltuğuma verib saldılar eşiyə.* Ə.Haqverdiyev.

2. Bayır tərəfə baxan, çıxan, eşiyə tərəf olan. *..Eşik otaqda, qəzetlərə sərilmiş qərənfil və xrizantem dəstələri açılıb hazırlandı.* M.S.Ordubadi. *Eşik qapı dəhlizə açılırdı.* Mir Cəlal. *Muxtar əmi evin eşik divarına söykəndi.* M.Hüseyn.

3. Bir şeyin bayır hissəsi, çöl tərəfi. *Qazanın eşiyini də, içini də ağartdırmaq.*

4. Bax **ev-eşik**. *Gözəllik babında şahicahansan; Eşiyində yüz min qullar dolanır.* M.P.Vaqif. [Tükəzban:] *Anası ölmüş ev bilmir, eşik bilmir, təkdənbir gələndə də gözünə yuxu getmir.* M.Hüseyn.

**EŞİKAĞASI** *is.* 1. *tar.* Şah saraylarında təşrifat məmuru. [Nadir şah] *eşikağası mənsəbini* [İbrahimxəlil ağanın oğlu Fəzləli bəyə] *münasib gördü və bu qulluğu o mərhumə verdi.* M.Adıgözəlbəy. *Zamanı eşikağası işdən agah etdi, biçarə mehtər xanın ayağına yıxıldı..* Çəmənzəminli. *İbrahim xan şairin istedadına şəxsən inanıb, onu özünə yaxınlaşdırdı və 1769-cu ildə eşikağası vəzifəsinə təyin etdi.* F.Köçərli.

2. *köhn.* Keçmişdə: böyük adamların evində süfrəni və ev xidmətçilərini idarə edən şəxs; nökərbaşı. *Xan taların sədrində taxt üstündə oturubdur*: *hüzurunda durubdur Səlim bəy eşikağası, əlində çomaq və hər iki tərəfdən Lənkəran bəylərindən neçələri səf çəkiblər..* M.F.Axundzadə. *Bu adam rəisin eşikağası idi.* Mir Cəlal.

**EŞİLMƏ** "Eşilmək"dən *f.is.*

**EŞİLMƏK** *məch.* 1. Eşik-eşik edilmək, qazılmaq, qazıq-qazıq edilmək. *Meşələr kökündən eşilir, qocaman palıd ağacları hərləməsinə qazılır, kökündən və damarlarından kəsilir, gurultu ilə yerə gəlirdi..* S.Rəhimov.

2. Burum-burum edilmək, burulmaq. *İp eşilmək.*

**EŞİM-EŞİM** *sif.* Buruq-buruq, buruq, burum-burum. *Eşim-eşim dağ yolu.*

**EŞİTDİRİLMƏ** "Eşitdirilmək"dən *f.is.*

**EŞİTDİRİLMƏK** *məch.* Hiss etdirilmək, qulağına çatdırılmaq, xəbərdar edilmək, bildirilmək.

**EŞİTDİRMƏ** "Eşitdirmək"dən *f.is.*

**EŞİTDİRMƏK** *icb.* Qulağına çatdırmaq, hiss etdirmək, xəbərdar etdirmək, bildirmək. [Xədicə] *indi isə mahnı oxuyub səsini mənə eşitdirirdi.* S.Hüseyn. *Sona .. əmisi arvadını sıxma-boğmaya salanlara da eşitdirmək istəyib bərkdən dedi..* Ə.Əbülhəsən.

**EŞİTMƏ** "Eşitmək"dən *f.is. Eşitmə orqanı.*

**EŞİTMƏK** *f.* 1. Hər hansı bir səsi qulaqla qavramaq, almaq, duymaq, mənimsəmək. *Danışanların səsini eşitmək. O biri otaqdan səs eşitmək. – Əz qaza Gülbadamın səsini kəndin kənarından keçərkən bir adam eşidib səslənir*: *– Ay adam, kimsən?* N.Nərimanov. *Birdən-birə .. at kişnəməsi eşitdim.* H.Nəzərli.

2. Dinləmək, qulaq asmaq, fikir vermək. *Məclis natiqi elə gərgin diqqətlə eşidirdi ki, milçək uçsa, duyulardı.* Mir Cəlal. *Eşidin, nə deyir*: *"İki gün əvvəl; Niyə gecikmişdin? Bundan danış gəl!"* M.Rahim.

3. Xəbərdar olmaq, xəbər almaq, xəbər tutmaq, məlumat əldə etmək, agah olmaq, bilmək. *Həsən ağa dedi*: *– Mən səni gözaydınlığı verməyə çağırdım, eşitdim uşaqların məktəbi qurtarıblar, gözün aydın!* Ə.Haqverdiyev. *Axşam bacımdan eşitdim ki, Xədicə qorxduğundan xəstələnmişdir.* S.Hüseyn.

4. Sözə baxmaq, əməl etmək, nəsihət qəbul etmək. *Böyüyün sözün eşit! – Qızım sənə deyirəm, gəlinim sən eşit!* (Məsəl). *Nə gərəkdir bizə o növ söhbətlər; Eşidin pəndlər, nəsihətlər.* S.Ə.Şirvani. [Xidmətçi:] *Onun dostluq etdiyi qadınlardan şübhələnirəm. Xüsusən onun bugünkü səyahəti də qorxuludur, onu bu səyahətə buraxmayın, o sizin sözünüzü eşidər!* M.S.Ordubadi.
□ **Eşidər-eşitməz** – eşidən kimi, dərhal, o saat. *Fərman bu adı eşidər-eşitməz böyük sevinclə onun əlini sıxdı.* Ə.Sadıq.

**EŞİTMƏMƏZLİK** *is.* 1. Eşitmək qabiliyyətinin olmadığı hal; karlıq.

2. Eşitməmə, dinməmə, qulaq asmama, əməl etməmə.

◊ **(Özünü) eşitməməzliyə vurmaq (qoymaq)** – özünü eşitməyən kimi göstərməyə çalışmaq, əhəmiyyət verməmək, etina etməmək, qulaqardına vurmaq. *Mən özümü eşitməməzliyə qoyub qapını taybatay açdım.* Qantəmir. *Müqim onun atmacasını eşitməməzliyə vurmaq istədisə də, bacarmadı.* S.Rəhimov. ..[Qulu] *özünü eşitməməzliyə vuraraq, sağ əlini yuxarı qaldırdı.* İ.Əfəndiyev.

**EŞİTMƏZLİK** b a x **eşitməməzlik**. *Əttar Həsən eşitməzlik edib evə girdi və qapını çəkib bərk örtdü.* Çəmənzəminli.

**EŞQ** *is.* [*ər.*] 1. Sevgi, məhəbbət, sevda, böyük istək hissi, sonsuz bağlılıq. *Vətən eşqi. Övlad eşqi. Həyat eşqi. – Can vermə qəmi-eşqə ki, eşq afəti-candır; Eşq afəti-can olduğu məşhuri-cahandır. Füzuli. Dilidivanə sevər can tək o zülfi-siyəhi; Başının şurini gör, eşqdə sevdasına bax.* S.Ə.Şirvani. *Eşq sözü sözlərin sultanıdır, tacıdır; Eşq – həyat ağacıdır!* B.Vahabzadə.

2. Şiddətli arzu, həvəs, meyil, istək. *Sözün eşqilə, qəlbilə yaşar aləmdə insanlar;*

*Sözün səyyar xəyalilə uçar əflakə dastanlar.* S.Vurğun. *Ala çiçəklərlə ala sürülərin doğma yurdunda dincələn əsgərlər hücum eşqi ilə çırpınırdılar.* Ə.Vəliyev.

3. Müxtəlif obrazlı tərkiblərdə: eşq əhli, eşq aləmi, eşq yarası, eşq afəti, eşq quşu, eşq dəryası, eşq odu, eşq əsiri və s. şəklində işlənib sevgi, məhəbbət hisslərini bildirir. *Eşqin xəncərini vurdum sinəmə; Dərin yaralarım deşdim də gəldim.* "Aşıq Qərib". *Yoxsa çıxılmayan eşqin dağında; Ömrünün dirilik çeşməsi qaynar.* M.Müşfiq.

◊ **Eşq yetirmək** – sevmək, vurulmaq, aşiq olmaq, bənd olmaq, məhəbbət yetirmək. *Xırda qız ağıllı-başlı Məlik Cümşüdə eşq yetirmişdi.* (Nağıl). *Bir neçə il ondan sonra Mirzə qonşunun qızına eşq yetirib anasını elçi göndərdi.* Ə.Haqverdiyev. **Eşq olsun!** – mədh, tərif yerində işlənir (bəzən "afərin" mənasında da işlənir). *Deyirəm, eşq olsun dünən və bu gün; Azadlıq yolunda can verənlərə!* B.Vahabzadə. **Eşqə düşmək (tutulmaq, giriftar olmaq** və s.**)** – 1) aşiq olmaq, sevmək, bənd olmaq, vurulmaq. *Qəm evində zar olalı; Eşqə giriftar olalı; Yarımadıq yar olalı; Nə mən səndən, nə sən məndən.* Q.Zakir. *Görcəyin gözəl Leylini; Bəyəndim şirin dilini; Eşqə bələndim, meylini; Bil mana sarı görəndə.* Aşıq Ələsgər; 2) hədsiz dərəcədə bir şeyin həvəsində, həsrətində olmaq, arzusunu çəkmək, istəmək. *Axırda mən özüm də bir belə eşqə düşdüm ki, özümə bir yan tütəyi ələ gətirib başladım yavaş-yavaş çalmağa...* C.Məmmədquluzadə. **Eşqə gəlmək** – təbə gəlmək, cuşa gəlmək, ilhamlanmaq. *Yenə də ortada imtahan gərək! Yoxsa ki, gündə bir eşqə gələrək; Sonra da ardınca baxıb ağlamaq; Əskiklik gətirir hər insana, bil!* S.Vurğun. *Sordum: – Nədən, gözəl çoban; Eşqə gəlib ney çalırsan?* N.Rəfibəyli. **Eşqə salmaq** – sevməsinə, aşiq olmasına səbəb olmaq, özünə aludə etmək. *Əğyarı eşqə salmağa ol şuxi-dilfirib; Qeyrilə görcəyin mənə çox eylər ehtiram.* S.Ə.Şirvani. **Eşqi cuşa (tüğyana) gəlmək** – həvəsə gəlmək, cuşa gəlmək, çox həvəslənmək. *Qoğuz padşahın eşqi cuşa gəldi, durub gəlməkdə olsun Nardan xanımın yanına.* (Nağıl). *Qurbani zindanda Pəri xanımı yadına saldı, eşqi tüğyana gəlib sazı sinəsinə basdı.* "Qurbani". **Allah eşqinə** – b a x **Allah**.

**EŞQBAZ** [*ər.* eşq və *fars.* ...baz] Qadın düşkünü, arvadbaz, aşiqanə macəraları sevən adam.

**EŞQBAZLIQ** *is.* 1. Eşq macəralarına meyil, yalandan eşq yetirmə, məhəbbətdən danışma, sevişmə. *..Uşaqlarımız bekar qalanda ya gərək teatrlarımıza gedib eşqbazlıq nümayişlərinə tamaşa eləsinlər, ya gərək küçə qapılarının ağzına yığışıb yoldan ötüb keçənlərə "ğoğo" eləsinlər..* C.Məmmədquluzadə. [Qafar:] *Mən necə səni eşqbazlıq teatrına aparım.* S.S.Axundov.

2. Aşiqlik, vurğunluq. *Şərm eylə bu eşqbazlıqdan; Bifaidə cangüdazlıqdan!* Füzuli. *Ağlını cəm elə, olma sərsəri; Səndə yoxdur eşqbazlıq əsəri.* Aşıq Pəri. ◻ **Eşqbazlıq eləmək** – aşiqanə macəralarla məşğul olmaq, arvadların dalınca düşmək, arvadlarla sevişmək, onlara yalandan eşq yetirmək. [Nəcəf:] *Mən eşqbazlıq eləyəndə sən heç ananın qarnında yox idin.* İ.Əfəndiyev.

**EŞQLİ** *sif.* Hərarətli, həyəcanlı, ehtiraslı. *Eşqli qəlb. – Qan salmağa aralığa; Çox eşqli pərvanəsən.* "Qurbani". [Rüxsarə] *..ancaq Həsənin hərarətli nəfəsi ilə eşqli dodaqlarını hiss edirdi.* T.Ş.Simurq.

**EŞQNAMƏ** *is.* [*ər.* eşq və *fars.* ...namə] Aşiqanə məktub, eşq, sevgi ifadə edən məktub. *Bir-birlərinə deyəcəkləri sözləri aylardan bəri əzbərləmişdilər, ortalığa atılaraq arzular böyük həcmli bir eşqnaməni təşkil edirdi.* M.S.Ordubadi. ◻ **Eşqnamə oxumaq** – məhəbbət elan etmək (adətən mənfi mənada). [Əsgər Soltan bəyə:] *Axı belə iş yaxşı deyildir, özgənin arvadına eşqnamə oxuyursan!* Ü.Hacıbəyov.

**EŞQPƏRVƏR** [*ər.* eşq və *fars.* ...pərvər] Eşq bəsləyən, eşq yetirən, sevən. [Sofiya xanım:] *Sizin bu qədər eşqpərvər bir qəlbə malik olduğunuzu zənn etməzdim.* Çəmənzəminli.

**EŞMƏ**[1] 1. "Eşmək"dən *f.is.*

2. *sif.* Burulmuş, eşilmiş, eşilib hazırlanmış. *Eşmə qamçı. – Molla uzun və qara müştüyün başına sancılmış eşmə papirosa qullab vuraraq ətrafına tüstü yayırdı..* T.Ş.Simurq. [Koxa:] *Şahməmməd, and olsun*

*bu eşmə bığa; Sənə yalan satmaz ömründə koxa.* S.Rüstəm.

**EŞMƏ²** *is.* Uşaqların aşıqla oynadıqları bir oyun adı.

**EŞMƏ-EŞMƏ** bax **eşim-eşim**. *Nəbinin bığları eşmə-eşmədir; Papağı gülllədən deşmə-deşmədir.* "Qaçaq Nəbi".

**EŞMƏK¹** *f.* 1. Qazımaq, qazıyıb açmaq, qurdalamaq (torpağı, qumu, külü və s.-ni). ..[Pələng də] *məni görmüşdü. Pəncəsi ilə acıqlı-acıqlı yeri eşir, dırmalayırdı.* A.Şaiq. *Səlim ilğım kolunun dibini balaca bel ilə eşməyə başladı.* S.Rəhimov

2. Burmaq. *Bığını eşmək.* – [Koroğlu] *pələ bığlarını eşib qulaqlarının dalına keçirdi.* "Koroğlu". *..Məmməd kişi kababı yeyib yağlı əlləri ilə bığlarını eşdi.* S.Rəhman.

3. Barmaqla hazırlamaq, sarımaq. [Daşdəmir:] *Çox yaxşı tütündür, birini eşin, dadına baxın.* M.Rzaquluzadə. ◻ **Papiros eşmək** – tütünü papiros kağızı arasına qoyub sarımaq, papiros hazırlamaq. *İskəndər itdən əl çəkib, həvəsli və kefli, şlyapasını krovatın üstünə çırpıb başlayır papiros eşməyə.* C.Məmmədquluzadə. *Qafar eşib müştüyə keçirtdiyi papirosuna bir-iki qullab vurdu.* Ə.Əbülhəsən.

4. Hörmək. *İp eşmək. – Bir ipək və ya keçə qurşağı .. eşərdilər. Buna turna deyərdilər.* H.Sarabski. *Qız-gəlinlər gün doğmamış oyanır; Gur saçına sığal verib eşməyə.* R.Rza.

5. *məc.* Əlləşdirmək, axtarmaq, araşdırmaq, qurdalamaq, töküşdürmək. *Qazı .. kitabları eşib bir qara cildli kitab götürüb açdı.* C.Məmmədquluzadə.

**EŞMƏK²** *is. məh.* Yaxası xəzli, gödəkqollu, qadın üst geyimi.

**EŞSİZ** *sif.* [*türk.*] 1. Yalqız qalmış, tək qalmış; yoldaşsız, dostsuz, kimsəsiz.

2. Misilsiz, misli olmayan, tayı-bərabəri olmayan. [Xəyyam:] *Söylə, ey sevgili, eşsiz mələkim; Kim zəhər qatdı gülər ömrünə, kim?!* H.Cavid.

**EŞŞƏK** *is.* 1. At fəsiləsindən iribaşlı, alçaqboylu, uzunqulaqlı yük və minik heyvanı; uzunqulaq. *Allaflar çuval-çuval arpa, buğda və saman alıb arabalara doldurur, eşşəklərə yükləyirdilər.* A.Şaiq. *Qulam dayının aldığı boz eşşək çox baha tamam oldu.* M.Hüseyn.

2. İnşaat zamanı bir şeyi saxlamaq üçün altdan qoyulan müvəqqəti dayaq, dirək. *Körpünün orta eşşəyi sındı.*

3. *məc. dan.* Qanmaz, kobud, küt, axmaq, cahil adam haqqında (söyüş kimi işlənir). [Nəcəf bəy:] *Eşşək, məlun! Sənin sözün də var ata qabağında danışmağa?!* Ə.Haqverdiyev.

4. *idm.* Gimnastika hərəkətləri üçün üzərinə meşin çəkilmiş, hündür dayaqlı tir.

◊ **Eşşək nə bilir zəfəran (plov) nədir, eşşək nə bilir xurmanın dadını** – qanmaz, yaxşı ilə pisə fərq qoya bilməyən adam haqqında. [Hüseyn:] *Sən nə anlayırsan artist nəyə deyirlər? Nə qədər eşşək zəfəranplovdan bir şey anlasa, bir elə də sən anlarsan ki, artist-tragik nədir?* Ə.Haqverdiyev. **İki eşşəyin arpasını bölə bilməmək** – heç bir işdə qabiliyyəti olmayan, bacarıqsız adam haqqında. *Onun vücudunu iki şahıya alan olmaz. Kütbaş, bisavad, iki eşşəyin arpasını bölə bilməyən.* M.Hüseyn.

**EŞŞƏKARISI** *is. zool.* Zərqanadlılar fəsiləsindən arıya bənzər sarı, parlaq qanadı olan, iynəli böcək.

**EŞŞƏKBELİSINDIRMA, EŞŞƏKBELİSINDIRDI** *is.* Uşaqların dombaltma durub biri-birinin belindən atılaraq oynadıqları oyun; atlanbac.

**EŞŞƏKBİYANI** *is. bot.* Yazdan bir qədər keçmiş bitən pis qoxulu alaq otu.

**EŞŞƏKÇİ** *is.* 1. *köhn.* Eşşəklərə baxan, xidmət edən mehtər. *Oraya yığılanlar kimdirlər? Biri xanın eşşəkçisinin nəvəsi deyilmi?* Ə.Haqverdiyev.

2. Eşşəyə minmiş adam. *Məhəmmədhəsən əlini eşşəkçinin qurşağına salıb çəkə-çəkə aparırdı.* C.Məmmədquluzadə. *Atlılar bir az dayandılar. Eşşəkçi yaxınlaşdı.* Mir Cəlal.

3. Eşşək ilə yük daşıyan, eşşək üstə xırda alver edən adam.

**EŞŞƏKÇİLİK** *is. köhn.* Eşşəklə yük daşıma peşəsi.

**EŞŞƏKQANQALI** *is. bot.* Tikanlı, dilikdilik yarpaqları olan yabanı bitki.

**EŞŞƏKLİ** *sif.* Eşşəyi olan. *Eşşəkli köç.*

**EŞŞƏKLİK** *is.* Qanmazlıq, anlamazlıq, kobudluq, heyvanlıq. *Planların alt-üst olmasına səbəb Kəşaninin eşşəkliyi və xamlığı*

*olmuşdu.* Qantəmir. ☐ **Eşşəklik eləmək** – axmaq bir iş görmək, tərbiyəsiz bir hərəkət göstərmək. [Allahqulu:] *..Eşşəklik eləyirəm mən ki, Veysin qəlbinə dəyirəm.* Ə.Əbülhəsən.

**EŞŞƏKOYUNU** *is. dan.* Axırı savaşmaya, qovğaya çevrilən qaba zarafat. *Eşşəkoyunu başlamaq.*

**EŞŞƏKTURPU** *is. bot.* Kökü turpa bənzər yabanı alaq otu.

**ETAJÉR(KA)** [*fr.*] Dirəklər üstündə duran rəflərdən ibarət mebel növü. *Bir tərəfdə qoyulub kitab qəfəsəsi* (*etajerka*)*, üstə kitablar, yanında bir dənə sandalya.* C.Məmmədquluzadə. *Akif .. etajerkadan kitab götürərək oxumağa başlayır.* M.İbrahimov.

**ETALÓN** [*fr.*] Müəyyən edilmiş ölçü vahidinin dəqiq nümunəsi. // İşlənməkdə olan ölçü alətlərini yoxlamaq üçün ən dəqiq ölçü nümunəsi; əyar. *Metrin etalonu. – Təhvil verilən pambığın sortunu qəbuledicilər etalon əsasında müəyyən edirlər.* "Pambıqçılıq".

**ETÁN** [*yun.*] *kim.* İşıq və neft qazlarında olan rəngsiz, yanar qaz.

**ETDİRİLMƏ** "Etdirilmək"dən *f.is.*

**ETDİRİLMƏK** "Etmək"dən *məch. ..Kinoların qabağına nümayiş etdirilən filmlərin şəkilləri vurulmuşdu.* M.İbrahimov.

**ETDİRMƏ́K** *icb.* Etməyə məcbur etmək.

**ETERNÍT** [*lat.*] *xüs.* Asbest və sement qarışığından hazırlanan süni şifer. *Eternit və yaxud asbest ilə sementdən hazırlanmış kirəmit .. xüsusi zavodlarda presləmək üsulu ilə nazik vərəqələr* (*4 mm*) *halında hazırlanır ki, bunlar damları örtmək üçün işlədilir.* S.Quliyev.

**ETİBAR** *is.* [*ər.*] 1. Bir şəxsin ixlasına, sədaqətinə, səmimiyyətinə, doğruluğuna, düzgünlüyünə inam, etimad, əmniyyət və bunlara əsaslanan münasibət. *İnsan oğlu can verər pərvanə tək atəşlərə; Düz sözün, düz ilqarın, düz etibarın eşqinə.* S.Vurğun. // *məc.* Vəfa. *Zakir, etibarı yoxdur dünyanın; Aldanma xeyrinə, şərinə anın.* Q.Zakir. *Lakin günəşdə etibar görünmürdü; yerdən buğ qalxır, dağların başı dumanlanır, üfüqlər bulaşmağa başlayırdı.* Çəmənzəminli. ☐ **Etibar etmək (göstərmək, qılmaq)** – inanmaq, etimad etmək, inam göstərmək. *Mən böylə qılırdım etibarı; Kim bundan olur könül qərarı.* Füzuli. *Amma keyfiyyət bir mərtəbədə qərib idi ki, Yusif Sərrac onun doğru olmağına, bavücudi ki, gözü ilə görürdü, hərgiz etibar edə bilmirdi.* M.F.Axundzadə. [Süleyman:] *Əsgər mənə etibar edib elçiliyə göndəribdir, özü də qıza bənddir.* Ü.Hacıbəyov.

2. *klas.* Ad, san, şərəf, hörmət, nüfuz. *Getdi şənimiz, etibarımız; Varmı rütbəmiz, iqtidarımız.* M.Ə.Sabir. *Keyfə sərf eylədim də milyonlar; Yenə dövlətcə etibarım var.* H.Cavid. ☐ **Etibardan düşmək, etibarını itirmək, etibarı qalmamaq** – 1) hörmətdən düşmək, nüfuzunu itirmək. *Bundan sonra zəmanədə mən mərəzə şaiqəm; Çün düşmüşəm yanında onun etibardən.* S.Ə.Şirvani; 2) daha mötəbər olmamaq, özünə olan inamdan məhrum olmaq; 3) qüvvəsini, təsirini itirmək (sənəd haqqında). **Etibarı olmaq** – 1) inanılmaq, başqasının yanında etimadı olmaq; 2) möhkəm olmaq, davamlı olmaq.

3. *klas.* Əhəmiyyət, məna. *Görmüşəm ləlini, lazımdı tökülsün qanım; Etibar olmaz əgərçi görələr qan yuxuda.* S.Ə.Şirvani.

4. "ilə" qoşması ilə: **etibarı ilə** – fərz edərək, ...nəzərə alaraq, ...əsasən, ...görə, ...kimi. *Bu dövrdə böyük yazıçının hekayələri forma etibarı ilə ən çox novella xasiyyəti daşıyır.* M.İbrahimov.

**ETİBARƏN** *zərf* [*ər.*] Başlayaraq, sayılmaq surəti ilə. *Martdan etibarən. O gündən etibarən. – Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini quşbazlıq, tazıbazlıq, xoruzbazlıq və bu kimi işlərə verərdi.* H.Sarabski. *Xəlil qət etdi ki, sabahdan etibarən o da bekar dayanmasın, bir işin qulpundan yapışsın.* İ.Məlikzadə.

**ETİBARLI** *sif.* 1. Etibar edilməyə layiq olan, etibarı olan, inanılacaq, etimad ediləcək, sədaqətli, vəfalı. // Şübhə doğurmayan, həqiqi, dürüst. *Etibarlı mənbələrdən alınan məlumat.*

2. Etibarı olan, hörmətli, nüfuzlu, adlısanlı. *Etibarlı adam.*

3. Qanunən qüvvəsi, təsiri olan. *Etibarlı sənəd.*

4. Möhkəm, davamlı, bərk. *Bu divar etibarlıdır.*

**ETİBARLILIQ** *is.* 1. Sədaqətlilik, səmimilik, doğruluq, düzgünlük, inamlılıq.

2. Möhkəmlik, davamlılıq. *Kontakt birləşmələri elektrik aparatlarının çox məsul hissələri sayılır və aparatların işdə etibarlılığı onların konstruksiya və vəziyyətlərindən xeyli dərəcədə asılıdır.* P.Rüstəmzadə.

**ETİBARNAMƏ** *is.* [*ər.* etibar və *fars.* ...namə] Bir şəxsin və ya idarənin adından iş görmək üçün verilən rəsmi kağız, sənəd. *Etibarnamə ilə kassadan pul almaq. – Körpüdə taxtanı buraxmaq üçün etibarnamə istəyirdilər.* Mir Cəlal.

**ETİBARSIZ** *sif.* 1. Etibarı olmayan. *Etibarsız yoldaş. Etibarsız dost. – Etibarı kəsib, etibarsız yar; Əl qaldırıb, özgə yara yalvarar.* "Lətif şah". ◻ **Etibarsız çıxmaq** – verdiyi sözdən, vədədən qaçmaq, vəfasızlıq göstərmək.

2. Etibara, inanılmağa layiq olmayan; etibarını itirmiş.

3. Sözü keçməyən, nüfuzu, hörməti olmayan; şərəf və heysiyyəti olmayan. *Etibarsız adam.*

4. Qanuni qüvvəsini, təsirini itirmiş, etibarını itirmiş. *Bu vəsiqə etibarsızdır.*

5. Möhkəm olmayan, davamlı olmayan.

**ETİBARSIZLIQ** *is.* Etibar, etimad olmadığı hal, vəziyyət. *Kuyində bu etibarsızlıq; Bəsdir məni-mübtəlayi-zarə.* Əmani.

**ETİDAL** *is.* [*ər.*] 1. Mötədillik, mülayimlik, orta halda olma; tam lazım olduğu dərəcədə, həddə olma.

2. Soyuqqanlılıq, sakitlik, təmkin. *Nizami və Fəxrəddinə göstərilən bu qədər səmimi münasibət Qətibənin əsəblərinə toxunsa belə, öz etidalını pozmayaraq yenə də Azərbaycan nümayəndələrinin rahatlığı üçün hər bir vasitənin hazır edilməsinə diqqət verdi.* M.S.Ordubadi. *Mehriban Zeynalın belə gecikməsinə əhəmiyyət verməyirdi. Etidalını pozmadan oturub çocuqlarına paltar tikirdi.* S.Hüseyn.

3. "la" şəkilçisi ilə: **etidalla** yaxud **kəmali-etidalla** *zərf* – soyuqqanlılıqla, səbirlə, təmkinlə, sakit surətdə. [Səlim] *kəmali-etidalla gözləyirdi ki,* [Mehriban] *ağlayıb ürəyini boşaltsın.* S.Hüseyn. *Ramazan yenə də etidalla cavab verdi.* M.Hüseyn.

**ÉTİKA** [*yun.* ethika, ethos – adət, xasiyyət] 1. İctimai şüur formalarından biri kimi əxlaq, tərbiyə və mənəviyyat haqqında fəlsəfi nəzəriyyə. *Materialist etika. Hegel etikası.*

2. Hər hansı sinfin, cəmiyyətin, ictimai təşkilatın əxlaq qaydaları. *Kapitalist cəmiyyətinin etikası. Dvoryan etikası. – Əsil etika açıq danışmağı sevir.* M.Hüseyn.

**ETİKÉT** [*fr.*] Malın, eksponatın və s.-nin üstünə yapışdırılan, üzərində onun adı, qiyməti və s. olan; yarlıq.

**ETİKETLƏMƏ** "Etiketləmək"dən *f.is.*

**ETİKETLƏMƏK** *f.* Mala etiket vurmaq.

**ETİKETLƏNMƏ** "Etiketlənmək"dən *f.is.*

**ETİKETLƏNMƏK** *məch.* Mala etiket vurulmaq.

**ETİQAD** *is.* [*ər.*] 1. Bir şeyə qəlbən və möhkəm inanma, inam. [Dilarada] *ədalətin, haqqın qələbə çalacağına möhkəm bir etiqad vardı!..* M.İbrahimov. // Əqidə, qənaət, fikir. *..Bizim camaatın arasında bu etiqad var idi ki, rus hakimləri müsəlman hakimlərindən artıq təhsil görmüş və təcrübə hasil etməmişdilər.* C.Məmmədquluzadə. [Mərhumun qardaşı:] *Çünki seyidin qulluğuna etiqadla getməmişdi. Əlbəttə, etiqad böyük şərtdir.* Ə.Haqverdiyev. ◻ **Etiqad etmək (eləmək, bəsləmək)** – qəlbən və möhkəm inanmaq, iman gətirmək, ürəkdən təsdiq etmək. *Bir parça buludun yağış yağdırmasını güman etməsəm də, ancaq Nisə xala məndə elə bir təsir buraxmışdı ki, onun hər dediyinə etiqad edirdim.* Qantəmir. *Hər hansı müalicə içərisində xəstənin özünün etiqad bəslədiyi müalicə ən birinci vasitədir.* S.Rəhimov.

2. *din.* Bir din və məzhəbə inanma, inam. *Mən elə hacı tanıyıram ki, özünün heç bir zada etiqadı olmaya-olmaya Məkkəyə müşərrəf olur.* Ə.Qəmküsar. *Kərbəlayı Məhəmməd ustanın hekayəsi bitən kimi, dərin bir etiqad ilə gözünü göyə çöndərdi.* Çəmənzəminli.

**ETİQADCA** *zərf* Etiqada görə, əqidəcə, məsləkcə, məzhəbcə.

**ETİQADLA** *zərf* Möhkəm inamla. *Fərhadoğlu istəyirdi ki, dərin etiqadla işdən-gücdən yapışan gəncliyə qarışsın.* S.Rəhimov. *İbrahim Məşədi bəyin sakit axan gözlərində qığılcıma bənzər bir şey yandığını görəndə bu sözləri necə dərin bir etiqadla dediyini hiss edib təsəlli tapdı.* M.Hüseyn.

**ETİQADLI** *sif.* Bir şeyə etiqadı olan, möhkəm əqidəli, məsləkli. *Etiqadlı adam.*

**ETİQADSIZ** *sif.* Etiqadı olmayan, heç bir şeyə inanmayan. *Etiqadsız adam.*

**ETİQADSIZLIQ** *is.* Heç bir şeyə inanmama, etiqadı olmama; inamsızlıq.

**ETÍL** [*yun.* aith(er) – hava və hyle – maddə] *kim.* Bir çox üzvi birləşmələrin tərkibinə daxil olan karbon və hidrogen atomları qrupu.

**ETİLA** [*ər.*] *tənt. klas.* Yüksəlmə, ucalma; yüksəklərə qalxma, yüksəliş; tərəqqi. *Mən bu sözlərimlə nə dedim bilsən*: – *Çırpın üfüqlərə, uç etilaya!* S.Vurğun.

**ETİLÉN** [əsli *yun.*] b a x **etil** *kim.* Tərkibi karbon və hidrogendən ibarət olan rəngsiz yanıcı qaz.

**ETİMAD** *is.* [*ər.*] Etibar, inam, inanma. *İqbalıma yoxdur etimadım; Müşkül görünür mənim muradım.* Füzuli. *Sən o deyilmidin, dedin*: – *Var bizim ittihadımız? Mən də, yadında var, dedim*: – *Yox buna etimadımız.* M.Ə.Sabir. □ **Etimad etmək** – inanmaq, etibar etmək, bel bağlamaq.

**ETİMADKAR** b a x **etimadverici**. *Xanımın şirin və etimadkar səsi mərsiyəxanın mühakimələrinə qələbə çalmağa başladı.* Çəmənzəminli.

**ETİMADLI** *sif.* Etibarlı, inanılan, bel bağlanıla bilən, sədaqətli. *Etimadlı adam.* – *Məktub Zahir Bəlxinin ən etimadlı qulamı olan Bəsirə tapşırıldı.* M.S.Ordubadi. *Professorun hərarətli və etimadlı danışığı hamının diqqətini cəlb etmişdi.* Mir Cəlal. [Sarxan] *..ən etimadlı adamlardan ibarət balaca özəklər düzəltmişdi.* M.İbrahimov.

**ETİMADNAMƏ** *is.* [*ər.* etimad və *fars.* ...namə] Bir dövlətin nümayəndəsinin başqa dövlət yanında səfir olduğunu təsdiq edən sənəd. *Yeni səfir etimadnaməsini təqdim etdi.*

**ETİMADSIZ** *sif.* 1. İnanıla bilməyən, bel bağlanıla bilməyən, etibarsız. *Etimadsız adam.*

2. Şübhə ifadə edən. *Müəllimin daha saralmış və gözəl biçimli dodaqlarında etimadsız və şübhəli bir təbəssüm gəzirdi.* Ə.Vəliyev.

**ETİMADSIZLIQ** *is.* Etimad etməmə, ürək qızdırmama; etibarsızlıq, inamsızlıq. *Bu baxış .. bir etimadsızlıq demək idi.* M.S.Ordubadi.

**ETİMADVERİCİ** *sif.* İnandırıcı, ümidverici, inamlı, etibarlı. *Xanın vəziyyəti məclisi də kiriməyə məcbur etdi. Dərin sükutu Vaqifin yumşaq, lakin etimadverici səsi pozdu.* Çəmənzəminli.

**ETİMOLÓGİYA** [*yun.* etymon – həqiqət və logos – elm] *dilç.* 1. Dilçiliyin, sözlərin qohumluq əlaqələri və mənşəyindən bəhs edən şöbəsi.

2. Sözün mənşəyi və onun eyni dildə, yaxud başqa dillərdəki sözlərlə qohumluq münasibəti. *Sözün etimologiyası yaxşı məlum deyil.*

◊ **Xalq etimologiyası** *dilç.* – başqa dildən keçmə sözün ana dilinin səs qanunlarına uyğunlaşdırılıb işlənməsi.

**ETİMOLOJÍ** *sif.* [*yun.*] Etimologiyaya aid. *Etimoloji lüğət. Sözün etimoloji təhlili.*

**ETİMÓLOQ** [*yun.*] *dilç.* Etimologiya mütəxəssisi.

**ETİNA** *is.* [*ər.*] Artıq diqqət yetirmə, əhəmiyyət vermə, sayma. □ **Etina etmək** (**eləmək, qılmaq**) – saymaq, əhəmiyyət vermək, diqqət yetirmək, fikir vermək. *Yeməyə, içməyə etina qılmır; Heç alnının qırışığı açılmır.* A.Səhhət. **Etina etməmək** – saymamaq, fikir verməmək. *Dünyada yaltaqlıq nə olduğunu Mirzə bilməzdi. Bir bəyə, bir xana etina eləməzdi və deyərdi: "Nə vaxt qapılarına çörəyə getsəm, verməsinlər".* Ə.Haqverdiyev. *Qazının qısıla-qısıla gəlməyinə ağa artıq etina etməyib, bir az da irəli gəlməyə aman verir.* Çəmənzəminli.

**ETİNASIZ** *zərf* Saymazcasına, saymazyana, fikir vermədən, diqqət yetirmədən, əhəmiyyət vermədən. *Etinasız danışmaq. Etinasız cavab vermək.* – *Qadın olduqca vüqarlı və etinasız bir surətdə gedir və Fəxrəddinin onu təqib edib-etməməsinə diqqət vermirdi.* M.S.Ordubadi. *Etinasız baxmasın sənə; Divarlarında sükuta dalıb; Qarış-qarış yüksəltdiyin; Binada yaşayanlar.* R.Rza.

**ETİNASIZCA(SINA)** *zərf* Saymadan, əhəmiyyət vermədən, etina etmədən, laqeydcəsinə. *Qara və yorğa atlı bir cavan, atını lap qabaqda və etinasızca sürürdü.* Ə.Vəliyev.

**ETİNASIZLIQ** *is.* Diqqətsizlik, hörmətsizlik, sayğısızlıq; saymamazlıq, fikir verməmə, əhəmiyyət verməmə. *Etinasızlıq etmək. Etinasızlıq göstərmək. – Nina bu etinasızlığın zəminəsini çoxdan bəri mənə xəbər vermişdi.* M.S.Ordubadi. *Qoşatxan .. kobudu yerində oturdar, dikbaşa etinasızlıq göstərərdi.* M.İbrahimov.

**ETİOLÓGİYA** [*yun.* aitia – səbəb və logos – elm] *tib.* 1. Xəstəliyin törənməsi səbəbləri və şəraitindən bəhs edən elm.

2. Hər hansı bir xəstəliyi törədən səbəblər. *Xəstəliyin etiologiyası bəlli deyildir.*

**ETİOLOJİ́** *sif.* [*yun.*] *tib.* Etiologiyaya aid, etiologiya ilə bağlı olan. *Etioloji məlumat.*

**ETİRAF** *is.* [*ər.*] Öz qüsur və nöqsanını, az-çox özünün günahı olan bir şeyi inkar etməyib, qəbul etmə, təsdiq etmə, boynuna alma. *Yüz şükr ki, yox sənə xilafım; İnsafım var, var etirafım.* Füzuli. *Qadının etirafı və yaxud təsdiqi mənim marağımı təskin etmirdi.* S.Hüseyn. *Əlyar koftanın cırılmasına aid Rüxsarənin etirafını istintaq protokoluna qeyd edərək, bugünkü sorğunu bununla bitirmiş hesab etdi.* S.Rəhimov. ◻ **Etiraf etmək (eləmək)** – öz qüsurunu, günahını, təqsirini qəbul etmək, boynuna almaq, təsdiq etmək. *İnanma gər desə rəmmal sirriqeybə agahəm; Dəhanın sirrinə yüz kərrə iczin etiraf eylər.* S.Ə.Şirvani. [Səlim:] *Getmək qolay, ancaq sən etiraf et; Anlat başından keçəni büsbütün.* H.Cavid. *Lətifə öz səhvini etiraf eləməyə utanırmış kimi, Tahirin üzünə hələ də düz baxmırdı.* M.Hüseyn.

**ETİRAZ** *is.* [*ər.*] Bir fikri, təklifi, qərarı və ya hərəkəti qəbul etməyərək onun əleyhinə çıxma, qəti narazılığını bildirmə. *Özündən qıl riyanı tərk, əgər vardır hünər səndə; Deyil əhli-riyayə etirazın bir hünər, vaiz.* S.Ə.Şirvani. *Səriyyə xalanın bütün etirazları puça çıxdı.* S.Rəhman. ◻ **Etiraz etmək** – qəti razı olmadığını bildirmək, razılaşmamaq, qəbul etməmək. *Ey səlamət əhli, al rüxsarə baxma zinhar! Etiraz eylə məlamətdən, məni-rüsvayə bax!* Füzuli. *Qətibə bu fikrə etiraz etdi..* M.S.Ordubadi. *Anası .. qızının səfərinə etiraz etmək istədi.* Ə.Məmmədxanlı.

**ETMƏ** “Etmək”dən *f.is.*

**ETMƏK** *f.* 1. Bir işi yerinə yetirmək, əmələ gətirmək, görmək, eləmək. *Qurbani der: könlüm bundan sayrıdır; Nə etmişəm yarım məndən ayrıdır?* Qurbani. [Mehriban] *buna baxmayaraq, soyuqqanlılıqla cavab verdi: – Necə istəyirsiniz, ediniz!..* S.Hüseyn. [Yaqub:] *Əgər mən də oxuyub təhsil etsəydim, onda gərək mən da bir mədən sahibinin qabağında sürünüb, ona nökərçilik edəydim.* B.Talıblı.

2. Köməkçi feil kimi isimlərlə yanaşı işlənib mürəkkəb feil əmələ gətirdiyi zaman ismin mənası ilə bağlı olan hərəkəti bildirir; məs.: şəhadət etmək, dad etmək, düçar etmək, etina etmək.

**ETMƏKLİK** *köhn.* b a x **etmək**. *Mən bəni-adəm üçün görməmişəm səcdə ola; Səcdə etməklik üçün hanı həqqin fərmanı?* S.Ə.Şirvani.

**ETMƏKSİZİN** *zərf* Etmədən. *Nəsir ki heç bir vaxt Mirzə Qədirin sözündən çıxmazdı, hər əmrini tərəddüd etməksizin qəbul edər, onun hər fikrinə şərik olardı.* S.Hüseyn.

**ETNOGENÉZ** [*yun.* ethnos – xalq və genesis – doğulma] Hər hansı bir xalqın mənşəyi. *Azərbaycan xalqının etnogenezi. Slavyanların etnogenezi.*

**ETNÓQRAF** [*yun.* ethnos və grapho] Etnoqrafiya mütəxəssisi.

**ETNOQRAFİ́K** *sif.* [*yun.*] Etnoqrafiyaya aid olan, etnoqrafiya ilə bağlı olan. *Etnoqrafik muzey. Etnoqrafik əsər.* – [Vaqif] *..köçərilərin həyat və məişətini çox yaxşı bilirdi. Bu cəhətdən onun Molla Vəli Vidadi ilə yazışması böyük etnoqrafik əhəmiyyətə malikdir.* F.Köçərli.

**ETNOQRÁFİYA** [*yun.* ethnos və grapho – yazıram] 1. Xalqların maddi və mənəvi mədəniyyətlərini, onların mədəni-tarixi əlaqələrini tədqiq edən elm.

2. Bir xalqın, tayfanın, yerin məişət, adət, mədəniyyət xüsusiyyətlərinin məcmusu. *Qafqazın etnoqrafiyası. Asiya xalqlarının etnoqrafiyası.*

**ETNOQRAFİ́ZM** [*yun.* ethnos və grapho – yazıram] Bir şeydə etnoqrafik xüsusiyyətlərin, təsvirlərin, təfərrüatın mövcud olması, verilməsi (kitabda, pyesdə və s.-də).

**ETRŰSK** İtaliyada yaşamış qədim bir xalq və bu xalqa mənsub adam.

**ETŰD** [*fr.*] 1. Bir əsərin ilk qarası, eskizi. *Ulduz azad vaxtlarını daima ən kiçik otağında həvəskarı olduğu rəssamlığa sərf edər, müxtəlif etüdlər işlərdi.* Ə.Məmmədxanlı.

2. Ayrıca bir məsələyə həsr olunmuş kiçik ədəbi əsər. *Bioqrafik etüdlər. Tənqidi etüd.*

3. Məşq (musiqidə, səhnədə, şahmatda və s.-də).

4. Virtuoz mahiyyətində olan kiçik musiqi əsəri. *Süita şəklində yazılmış çoxhissəli musiqi əsərlərinə bəzən "eskiz" və ya "etüd" adı da verilir.* Ə.Bədəlbəyli.

**EV** *is.* 1. Yaşayış binası, həmçinin müxtəlif müəssisə və idarələri yerləşdirmək üçün bina, tikili. *Kərpic ev. Daş ev. Yaşayış evi. Altımərtəbəli ev. – On üç il bundan irəli evləri yazanda Danabaş kəndinin tüstü çıxanı düz altı yüz əlli ikiyə çatmışdı.* C.Məmmədquluzadə. *Şose yolu kənarında, sarı kirəmitli .. bir ev görünürdü.* M.Hüseyn. // Mənzil, otaq, ailənin yerləşdiyi yer. *Evə getmək. Evdən gec çıxmaq. Ev yığışdırmaq.* – [Mərcan bəy:] *Əlbəttə, boşayacağam, təvəqqe edirəm ki, bu gün mənim evimdən çıxasan.* Ü.Hacıbəyov. [Hacı Nəsir:] *Bir kasıb kişinin qızını alıb evimə gətirəcəyəm.* S.S.Axundov.

2. Zəhmətkeşlərin hər hansı bir mədəni-məişət ehtiyaclarına xidmət edən ictimai müəssisə, yer. *Ziyalılar evi. Körpələr evi. Müəllimlər evi. – Mədəniyyət evinin işıqlı və böyük zalı adamla qaynaşırdı.* M.İbrahimov.

3. Ailə, oğul-uşaq, külfət mənasında. *Evinə yaxşı baxır. Evin dərdini çəkmək. Evinə bağlı adam.* – [Məşədi Səttar:] *Əhvalın necədir, ev, uşaq salamatdırmı?* Ə.Haqverdiyev. ☐ **Ev açmaq (qurmaq)** – özünə ayrıca ailə qurmaq. *O, ata-anasından ayrılıb özünə ev açdı.* – [Kəmtərov və Leyla] *indi belə güman edirdilər ki, dəm-dəsgahlı ev qurmaq istəyənlərin, oxumuşluğun, qarşılıqlı sevgi ilə qurulmuş ailənin qaydası belədir ki, var.* Mir Cəlal. **Ev adamı** – 1) ailənin üzvü və ya ailəyə yaxın şəxs. *Başqa vaxt olsaydı, çoxdan ev adamından biri cumub* [Həmzənin] *paltosunu, papağını alaraq asqıdan asmışdı.* Ə.Əbülhəsən; 2) *köhn.* evfemistik yolla ərin öz arvadının adını çəkməmək üçün işlətdiyi ifadə. [Qoca kişi:] *Çünki dünən Yarməmmədin ev adamı gəlmişdi bizə, qarabaşımıza demişdi ki, Kərbəlayı Səfər evə gəlsə, ona bir de, gəlsin, bizim uşağa baxsın.* C.Məmmədquluzadə. **Ev arvadı (qadını)** – heç bir müəssisə və ya idarədə işləməyib, ancaq ev işləri və təsərrüfatı ilə məşğul olan qadın, evdar qadın. [Hurizad oğluna:] *Yaxşı, elə oxumuş qızdan ev qadını olarmı? – deyə ciddi sima ilə sordu.* Çəmənzəminli. *Üst qatlarda ev arvadı yoxdur ki?* Mir Cəlal. **Ev qulluqçusu** – muzdla başqasına müxtəlif ev işləri görən qadın (qız). [Məsmə:] *..Mənim həyatımın ikinci səhifəsi 23-cü ilin baharından başlayır. Bu zaman ev qulluqçularının sığorta edilməsi üçün qanun nəşr edilmişdi.* S.Hüseyn. **Ev olmaq, ev yiyəsi olmaq** – evlənmək, ailə qurmaq, ev-eşik sahibi olmaq. [Soltan bəy:] *Qızım, inad olma, .. gedərsən ərə, oğul-uşaq sahibi olarsan, ev yiyəsi olarsan.* Ü.Hacıbəyov. *Zarafat deyil, evlənir, ay parçası kimi bir qız alır. Ev olur, daha yurdsuzluqdan çıxır.* Mir Cəlal. **Ev sahibi, ev yiyəsi** *məc.* – ailənin başçısı, evin böyüyü. *Qonaq qonağı sevməz, ev yiyəsi hər ikisini.* (Ata. sözü). *Tahir ev yiyəsini bir də çağırdı.* M.Hüseyn. **Ev tökmək** – evin hər tərəfini silib-süpürmək, tamam təmizləyib yığışdırmaq. **Evdən çıxmaq** – ailədən küsüb getmək. [Mehriban] *Rəmziyyəsini kimə tapşırıb evdən çıxır, onları tərk edirdi.* S.Hüseyn.

4. Heyvan adlarının əvvəlində onların evdə bəsləndiyini, əhliləşmiş olduğunu bildirir. *Ev heyvanı. Ev quşu. Ev arısı. – Ev danası ev danasından qorxmaz.* (Ata. sözü). *Məşhur sayaçı sözlərində ev heyvanları bir-bir zikr olunur.* F.Köçərli.

5. Bəzi sözlərin əvvəlində, həmin sözlərin ifadə etdiyi şeylərin evlə bağlı və ya evə aid olduğunu, evdə işləndiyini, evdə hazırlandığını, yaxud evdə icra edildiyini bildirir. *Ev paltarı. Ev başmağı. Ev xörəyi. Ev çörəyi. Ev tapşırığı. Ev işləri.*

◊ **Ev bizim, sirr bizim** – gizli saxlanmalı olan söz, iş haqqında deyilir. *Ev bizim, sirr bizim, söhbətini elə, Fərmandan de!* Mir Cəlal. **Ev yıxmaq** – birinə pislik etmək,

bədbəxt etmək. [Mərcan bəy:] *Mənim evimi yıxdın, hələ bir gəlib pul da istəyirsən?* Ü.Hacıbəyov. **Evdə bişməyib, qonşudan gəlməyib** – haqqında heç bir şey bilinməyən, heç bir təsəvvür olmayan şey haqqında. *Axı neyləyim, evdə bişməyib, qonşudan gəlməyib, bir balaca tərpənəndə elə bilirəm çarpayı altımda yatacaq.* İ.Şıxlı. **Evdə qalmaq** – vaxtı keçdiyi halda ərə getməmək (qız haqqında). [Asya:] *Bəs ay Gülçöhrə, onda daha heç ərə getməyib, evdə qalıb un çuvalına tay olacaqsan?* Ü.Hacıbəyov. **Evdən (ev-eşikdən) uzaq, evlərdən iraq!** – ölüm və ya fəlakətdən danışarkən söylənən evfemistik ifadə. [Məşədi Məmməd:] *Allah evlərdən iraq eləsin, məni qorxudan elə işin burasıdır.* R.Əfəndiyev. **Evdən gəlmək** – pay gətirmək, əlidolu gəlmək. **Evi abad, evin abadan!** – yaxşılığa, hörmətə qarşı təşəkkür ifadəsi. [Əsgər Gülçöhrəyə:] *Xanım, evin abadan, sənin əlinin bərəkəti mənə bəsdir.* Ü.Hacıbəyov. **Evi başına götürmək** – bərkdən qışqırmaq, bağırmaq, çığırmaq. *Uşaq evi başına götürüb. – Buzov isə ardıarası kəsilmədən mələyir, evi başına götürürdü.* Ə.Əbülhəsən. **Evi başına uçulmaq** – b a x **evi yıxılmaq**. **Evi bərbad (viran) olmaq** – b a x **evi yıxılmaq**. **Evi viran olmuş (dağılmış, bərbad olmuş, yıxılmış)** – bədbəxt, zavallı, yazıq. *Nə çarə edim eşqimə pəs mən evi viyran; Yüz çöhrəyə mən müştəriyəm valehi-didar.* S.Ə.Şirvani. [Məşədi İmam:] *Axı, Məşədi evi yıxılmış başına nə daş salsın.* Ə.Haqverdiyev. **Evi yıxılmaq, evi bərbad olmaq** – ağır bir fəlakətə düçar olmaq, bəlaya düşmək, bədbəxt olmaq. *Eşiyin daşına ta dəydi rəqibin qədəmi; Evim ol ləhzə yıxıldı, başıma daş oldu.* S.Ə.Şirvani. *Qalar müsafiri-biçarə çarəsiz çöldə; Evi yıxıldı, əgər oğruya düçar oldu.* M.Möcüz. *Ədə, kişini qatıblar atın qabağına aparırlar, kişinin evi yıxıldı.* C.Məmmədquluzadə. **Evin tikilsin!** – alqış, tərif məqamında işlənən ifadə (bəzən etiraz bildirir). [Teymur:] *Ay evin tikilsin, on tümən elə mənim belimdəki fitənin qiymətidir.* "M.N.lətif". [Ələmdar Məşədiyə:] *Evin tikilsin! Tamahın Əlinin zülfüqarından da itidir!* S.Rəhimov. **Evin(i) yıxmaq** – pis yola aparmaq, xatalı işə cəlb etmək, bədbəxt etmək. *Deyir ki, Məşədi qorxulu yolnan gedir, oğlunu da özünə qoşub evini yıxır.* M.Hüseyn. [Tamaşa:] *Ağazalın evin yıxan elə siz olmadınızmı?* Ə.Əbülhəsən. **Evindən qaçaq düşmək** – hər hansı bir səbəbə görə ailəsindən uzaqlaşmaq, aralı yaşamaq. *Evindən düşəsən qaçaq; Sağ gözünə batsın bıçaq.* Qurbani. **Öz evini yıxmaq** – ehtiyatsızlığı üzündən özünü bəlaya salmaq, ağır vəziyyətə düşmək, özünü bədbəxt etmək. [Süleyman bəy:] *Kül mənim başıma, niyə mən böyüklər sözünə baxmadım, tay-tuşumu tanımadım, öz evimi yıxdım...* Ə.Haqverdiyev.

**EVAKUÁSİYA** *is.* [*lat.*] 1. Köçürülmə, əhalinin, idarə və təşkilatların müəyyən bir təhlükə ilə bağlı olaraq bir yerdən başqa yerə köçürülməsi.

**EVALTI** *is.* Köhnə evlərdə: anbar, zirzəmi.

**EVARASI** *sif.* Açıq və geniş miqyasda deyil, yalnız müəyyən evlər arasında, məhdud dairədə olan, icra edilən, aparılan. *Evarası alver. Evarası söhbət. – Belə dərvişlər .. avam adam axtarırlar ki, cibini soysunlar. Özləri də üç yerə bölünür: bazar dərvişləri, avtobus dərvişləri və evarası dərvişlər.* "Kirpi".

**EVBƏEV** *zərf* Bir-bir evləri dolaşaraq, heç bir evi buraxmayaraq, bir evdən o biri evə. *Evbəev dolaşmaq. – Bakıda oğulsuz qoca qarıların sənəti evbəev gəzib cavan oğlanları evləndirmək idi.* H.Sarabski.

**EVC** [*ər.*] b a x **övc**. *Aşkar oldu mənim dərdi-pünhanım; Evc etdi fələyə ahü-əfğanım.* Aşıq Yusif.

**EVCİK** 1. "Ev"dən *kiç.* [Gültəkin:] *..Qoyunuz son dəfə olaraq bütün xoşbəxt günlərimi keçirdiyim bu qaranlıq, məhzun evciyazi bir də doyunca görüm.* C.Cabbarlı. [Vidadi:] *Vaqif, sabah məni yola sal, gedim; Torpaq evciyimi ziyarət edim.* S.Vurğun.

2. B a x **evcik-evcik**. *Ağca xanım da evcik tikirdi. Çiçəkləri dərib onu bəzəyirdi.* S.S.Axundov.

**EVCİK-EVCİK** *is.* Uşaqların qumdan, torpaqdan evciklər düzəldib oynadıqları oyun. [Sabir:] *Mən həmişə onlara baxıram, bağımızda qumdan dam tikirəm, evcik-evcik oynayıram.* S.Rəhimov.

**EVCİL** *sif.* Evə və insana alışmış, əhli (*yabanı* ziddi). *Evcil heyvan. İt, pişik evcil heyvanlardır.*

**EVCİYƏZ** "Ev"dən *oxş. Budur, şəhərin ucqarında kiçik bir evciyəz qaralır.* Ə.Məmmədxanlı.

**EVDAR** *sif.* [ev və *fars.* ...dar] 1. Heç bir idarədə və ya müəssisədə işləməyib ancaq öz ev işləri ilə məşğul olan. *Bu təklifi eşidən evdar qadınlar binanın üst mərtəbəsinə dırmaşırdı.* Mir Cəlal.

2. Evli, uşaqlı, ailə sahibi, ailəsi olan. *Evdar adam.*

3. Ailəsini, ailə həyatını sevən, ailəpərəst, evcanlı. // Ailəsini yaxşı dolandıran, evinə, ailəsinə yaxşı baxan. *Evdar kişi. Evdar qadın.* – [Qadın:] *Aman, nə evdar adamsınız! – dedi.* Çəmənzəminli.

**EVDARLIQ** *is.* 1. Heç bir idarə, ya müəssisədə işləməyib ancaq öz ev işləri ilə məşğul olma. ☐ **Evdarlıq etmək** – öz ailə işləri ilə məşğul olmaq. [Şahbaz bəy:] *Arvad al, qoy evdə evdarlıq etsin, sən də kefdə, damaqda ol.* S.S.Axundov. [Məmməd:] *Nə olub bəyəm, mən ölmüşəm ki, sən indidən evdarlıq eləyəsən?* Mir Cəlal.

2. Evdar adamın xüsusiyyəti; ailəpərəstlik, ailəcanlılıq. *Baharın xasiyyətini, ləyaqətini və evdarlığını Rəhimə bəyənib evin cəmi ixtiyarını ona verdi.* S.S.Axundov.

**EVDOLUSU** *zərf* 1. Çoxlu, çox, külli miqdarda. *Evdolusu şey. – Bir balaca boyu var, evdolusu toyu var.* (Tapmaca). [Məşədi Məmməd:] *Pullu Hacı Rüstəmin qızını alsam, iki evdolusu cehiz, mal gətirər.* R.Əfəndiyev.

2. Çox ucadan, bərkdən. *Kərimqulu ayağını yerə döyüb bütün evdolusu bağırdı.* S.Rəhimov.

**EVDOVŞANI** *is. zool.* Ətlik və xəzlik üçün yetişdirilən dovşanaoxşar gəmirici heyvan.

**EVÉN** *is.* Sibirin şimal-şərq rayonlarında yaşayan və evenklərə yaxın olan xalq və bu xalqa mənsub adam.

**EVENCƏ** *sif.* və *zərf* Even dilində. *Evencə-rusca lüğət. Evencə danışmaq.*

**EVÉNK** *is.* Rusiya Federasiyası tərkibinə daxil olan Evenk milli dairəsində və Sakit Okeana qədər Şərqi Sibirdə yaşayan xalq və bu xalqa mənsub adam (keçmişdə bu xalqın adı tunqus idi). *Yenisey çayından şərqə doğru Oxot dənizinə qədər olan sahildə evenklər və ya rusların dediyi kimi, tunquslar yaşayırdılar.*

**EVENKCƏ** *sif.* və *zərf* Evenk dilində. *Evenkcə yazı. Evenkcə danışmaq.*

**EV-EŞİK** *is.* Ev, ailə, mülk və s.; ümumiyyətlə, evlə bağlı hər şey. *Ev-eşiyi əlindən çıxmaq. Ev-eşik düzəltmək.* – [Bəkir:] *Ev-eşiyimiz bərbad olub, var-yoxumuz əldən gedəndən sonra üzə çıxıb nə edəcəyik?* N.Vəzirov. [Hacı Nəsir:] *..Bu gündən bu ev-eşiyin xanımı sənsən, ancaq səndən təvəqqe edirəm ki, bu oğluma həqiqi analıq edib ürəkdən sevəsən.* S.S.Axundov. ☐ **Ev-eşik düzəltmək** – özü üçün ev və ailə qurmaq. *Telli dişi ilə, dırnağı ilə çalışmış, axır İslam üçün əməlli-başlı bir ev-eşik düzəltmişdi.* S.Hüseyn. **Ev-eşik sahibi (yiyəsi) olmaq** – b a x **ev olmaq, ev yiyəsi olmaq** ("**ev**"də). [Cahan xala:] *Neçə vaxtdır ki, mən sənə deyirəm: – Əsgər, gəl evlən, ev-eşik yiyəsi ol, oğul-uşaq sahibi ol.* Ü.Hacıbəyov. *Gülarə ilə evlənmək, bir neçə müddətdən sonra oğul-uşaq atası və ev-eşik sahibi olmaq fikri onun beynindən bir an çıxmırdı.* Ə.Vəliyev.

**EVFEMİSTİ́K** *sif.* [*yun.*] *dilç.* Evfemizm mahiyyətində olan. *Evfemistik ifadə.*

**EVFEMİ́ZM** [*yun.*] *dilç.* Müəyyən bir şərait üçün qaba və ya namünasib sayılan söz və ya ifadə yerinə işlədilən başqa, daha incə söz, ya ifadə; məs.: "arvadım" əvəzinə "uşaqların anası", "yalan danışırsınız" əvəzinə "düz demirsiniz" və s.

**EVKALİ́PT** [*yun.*] *bot.* Əsil vətəni Avstraliya olub, Qara dəniz sahillərində və Azərbaycanda da iqlimləşdirilib yetişdirilən ucaboylu, həmişəyaşıl, enliyarpaqlı ağac. *Ucaboylu, həmişəyaşıl, müxtəlif rəngli, çox ətirli yarpaqlarla örtülü olan evkalipt bitkisi parklara, bağçalara, küçələrə zinət vermək və sitrus bağlarını, çay plantasiyalarını küləkdən qorumaq məqsədi ilə becərilir.* İ.Axundzadə.

**EVLAD** [*ər.*] b a x **övlad**. *Məmməd evladlarını .. böyüdüb müəyyən yaşa yetirdikdən sonra, bunları məktəbə qoydu.* "Aşıq Qərib". *Məmmədhəsən əmi .. mehriban atadı, o heç*

*vaxt istəməzdi evladının ürəyini bir dəm sıxsın.* C.Məmmədquluzadə. [Kor kişi:] *sizə ata yerində, siz də ona evlad mövqeyində idiniz.* S.Hüseyn.

**EVLƏNDİRMƏ** "Evləndirmək"dən *f.is.*

**EVLƏNDİRMƏK** *f.* Birinə arvad (qız) alıb evli etmək. *Oğlunu evləndirmək.* – [Cahan xala:] *Rəhmətlik bacım canı ağzından çıxana kimi mənə deyərdi*: *Cahan, bax, Əsgəri sənə qoyub gedirəm, onu tək qoyma, evləndir.* Ü.Hacıbəyov. [Mirzə Həsən:] *Vəba ilində, Allah ölənlərinə rəhmət eləsin, rəhmətlik atam məni yenicə evləndirmişdi.* Çəmənzəminli. *Lakin evlərində xörək, yemək hazırlamağa bir arvad olmadığından atası Haşımı evləndirdi.* B.Talıblı.

**EVLƏNMƏ** "Evlənmək"dən *f.is. O günün sabahı Şərifzadə və Qəmər xanımın şahidliyi ilə Zeynalın Mehribanla .. evlənməsi zaqsda qeyd olundu.* S.Hüseyn.

**EVLƏNMƏK** *f.* Arvad almaq, ailə qurmaq üçün qanunən qadınla (qızla) birləşmək. *Zeynəb Xudayar bəyin evindən gedəndən iki ay sonra övrəti öldü və Xudayar bəyə evlənmək lap vacib oldu.* C.Məmmədquluzadə. [Kərimxan:] *..iyirmi yaşı olar-olmaz özü kimi yetimçilikdə böyümüş Xavər adlı yoxsul, lakin yaraşıqlı və nəcib təbiətli bir qızla evlənmişdi.* M.İbrahimov.

**EVLİ** sif. Arvadı olan, əri olan (ərli), ailəli. *Evli kişi. Evli arvad. – Kiçik əmioğlum hərçənd evli* (z.) *deyildi, lakin dul bacısı və onun iki yaşında oğlu ilə bir ailə kimi ayrıca yaşayırdılar.* S.S.Axundov. *Deyirlər ki, evli* (z.) *olmağın, uşaq babası olub külfət arasında ömür sürməyin özgə bir ləzzəti var.* A.Divanbəyoğlu.

**EVLİ-EŞİKLİ** 1. *sif.* Ailəsi, evi, dirriyi olan. *Evli-eşikli kişi. Evli-eşikli olmaq.* – [Xınalıq] *kəndinin çox dəcəlləri gözümüzün qabağında böyüyüb, evli-eşikli* (z.) *kişi olub. R.Rza.* [Kosaoğlu:] *Ay Nəsib, sən də lap gülməli adamsan. Bu sözləri bir evli-eşikli, arvadlı-uşaqlı adam desəydi, dərd yarı idi.* İ.Şıxlı.

2. *top.* Bütün ailə birlikdə, bir yerdə, *hamılıqla.* [Səfi:] *Atam-anam sənə qurban olsun, padşah! Keşiş budur, üç aydır ki, evli-eşikli bu vilayətdən qaçıbdır.* Ü.Hacıbəyov.

**EVLİK** 1. *sif.* Evə aid, evə məxsus, ailə ilə bağlı; ailəlik. *Əsəd Arazı əncir ağacı altına çəkdi*: *– Yox, evlik işim yoxdur.* A.Şaiq.

2. *köhn. evf.* Qadın, arvad mənasında. [İbad:] [Almaz] *dayanıb belə, bizim qardaşın evliyi də belə, bir az da özümü irəli verdim, gördüm yox, iş bir təhərdir.* C.Cabbarlı.

3. Saylarla evlərin miqdarını bildirir. *100 evlik kənd. – Beş yüz evlik, şəhər tipli gur bir qəsəbədə çalğıçı dəstəsinin olmaması qəribə görünsə də, ancaq bu belə idi.* Ə.Əbülhəsən.

**EVLİLİK** *is.* Evli adamın vəziyyəti, halı. *O, evliliyindən çox razıdır.*

**EVNƏ** bax **öynə**. [Bahar:] *Onlara çörəyi evnə ilə vermirlər.* Mir Cəlal.

**EVOLYUSİONİST** [*lat.*] Təkamül nəzəriyyəsi tərəfdarı.

**EVOLYUSİONÍZM** [*lat.*] bax **təkamül (təkamül nəzəriyyəsi)**.

**EVOLYÚSİYA** [*lat.*] bax **təkamül**.

**EVRİKA** [*yun.*] 1. Eramızdan əvvəlki Yunanıstanın riyaziyyatçı və mexaniki Arximedin adına yazılan nida cümləsi – "Mən tapdım!".

2. Hər hansı kəşflə bağlı söylənən nida cümləsi.

**EVSAF** [*ər.*] bax **ovsaf**. *Bir gözəl istərəm bu evsafda; Gözəllər içində xubtər olsun.* Aşıq Qurban. *Tanrı kəsibdir bizim ərlərin insafını; Sən ki bilirsən, "Baba", onların evsafını.* C.Cabbarlı.

**EVSİZ** *sif.* 1. Evi, mənzili olmayan. *Evsiz adam.* // İs. mənasında. *Evsizləri siyahıya almaq.*

2. Ailəsi olmayan.

**EVSİZ-EŞİKSİZ** *sif.* Yaşayacaq yeri; evi, ailəsi olmayan. [Nazlı:] *Təngə gəlmişəm. Adam evsiz-eşiksiz, onun-bunun küncündə nə qədər yaşayar?* İ.Məlikzadə.

**EVSİZLİK** *is.* Evi, ailəsi olmayan adamın vəziyyəti, halı.

**EVYARAN** *is.* Evləri yarıb oğurluqla məşğul olan adam; oğru. *Nə dilənçi qaldı, nə bir nəfər ac! Evyaran, başkəsən, quldurlar kimi.* S.Vurğun.

**EVYIXAN** *is.* Başqasını bədbəxt edən, başqasına hər cür pislik etməyə çalışan adam;

mərdimazar. *Məşhur məsəldir ki, düşər qarə gəzən kəs; Evyıxanın evin yıxar, əlbəttə, xudavənd.* Q.Zakir.

**EY**[1] *nida.* Müraciət, çağırış üçün işlənir. *Ey oğul! Ey dost! Ey mənim əziz qardaşlarım! – Sizi deyib gəlmişəm, ey mənim müsəlman qardaşlarım!..* C.Məmmədquluzadə. // Haraylama, haylama nidası. [Südçü] *isə arxamdan çağırıb*: *– Ey, bura bax!* [Atan] *gələcək, səni aldatdım, mən bu gün tez çıxmışam, – dedi.* A.Şaiq. *Ey şofer, "Moskviç"i-ni qovub apardılar! – deyə ilk dəfə söz atan qız indi bilavasitə Tahirə üz tutub qışqırdı.* M.Hüseyn.

2. İntonasiyadan asılı olaraq bəzən etiraz, narazılıq, istehza bildirir. *Nə var, ey! Bir desən nə istəyirsən? Balam, tovlayırsan bizi yenə sən.* S.Vurğun.

**EY**[2] b a x **eyi.** *Ey Füzuli, odlara yansın büsati-səltənət; Eydir ondan həq bilir bir guşeyi-gülxan mənə.* Füzuli. *Haq bilir, deyiləm mən ziyanlıqdan; Ölüm eydir belə zindəganlıqdan.* Q.Zakir.

**EYBƏCƏR** *sif.* 1. Xarici görünüşcə eyibli, nöqsanlı, çirkin; kifir. *Eybəcər qız. Eybəcər uşaq. – Fərhad xan bığıburma, yekəqarın, eybəcər bir pəhləvan idi.* (Nağıl). *Çünki onun, boy-buxununa görə, böyük olan başı tükdən daha da iriləşir, gözə bir az eybəcər gəlirdi.* Ə.Əbülhəsən. // İs. mənasında. *Eybi eylər eybəcər, soğanı yeyər dərdəcər.* (Ata. sözü). *Gördü gölün içində baxır ona bir nəfər; Bir bədheybət, eybəcər.* R.Rza. // Bədəninin bir yerində nöqsan olan. *Eybəcər gözlü qız. Eybəcər barmaqlı əl.*

2. *məc.* Təhrif edilmiş, korlanmış, biçimsiz, yöndəmsiz, mənasız, iyrənc, qeyri-adi. // Xoşa gəlməyən, nifrət oyandıran, çox pis, çirkin. *Müdhiş və eybəcər bir səslə vıyıldayaraq gələn minalar yalnız əsgərləri deyil, yeri-göyü də sarsıdırdı.* M.Hüseyn.

**EYBƏCƏRCƏSİNƏ** *zərf* Eybəcər hala salacaq dərəcədə. *Rüstəm kişiyə elə gəldi ki, Qoşatxanın əynindəki kostyum eybəcərcəsinə gendir.* M.İbrahimov.

**EYBƏCƏRLƏNMƏ** "Eybəcərlənmək"-dən *f.is.*

**EYBƏCƏRLƏNMƏK** b a x **eybəcərləşmək**.

**EYBƏCƏRLƏŞDİRİLMƏ** "Eybəcərləşdirilmək"dən *f.is.*

**EYBƏCƏRLƏŞDİRİLMƏK** *məch.* 1. Eybəcər hala salınmaq; çirkinləşdirilmək.

2. *məc.* Təhrif edilmək, korlanmaq.

**EYBƏCƏRLƏŞDİRMƏ** "Eybəcərləşdirmək"dən *f.is.*

**EYBƏCƏRLƏŞDİRMƏK** *f.* 1. Eybəcər hala salmaq, kifirləşdirmək, çirkin etmək; çirkin göstərmək. *Bu paltar onu eybəcərləşdirir.*

2. Təhrif etmək, pozmaq, korlamaq, xarab etmək. *Formalizm formanı dağıdır, eybəcərləşdirir, məhv edir.* (Qəzetlərdən).

**EYBƏCƏRLƏŞMƏ** "Eybəcərləşmək"-dən *f.is.*

**EYBƏCƏRLƏŞMƏK** *f.* Eybəcər hala düşmək, kifirləşmək, çirkinləşmək, biçimsiz, yöndəmsiz şəkil almaq. [Qaraşa] *elə gəlirdi ki, Kələntər çox kök olduğundan, orta boyu bir az qısalır və eybəcərləşirdi.* M.İbrahimov.

**EYBƏCƏRLİK** *is.* 1. Eybəcər şeyin halı; kifirlik, çirkinlik, biçimsizlik. *Səməd acıqlandığı zaman üzündəki eybəcərlik daha aydın gözə çarpırdı.* M.Hüseyn. *..Eybəcərliyinə görə heç kəs* [Cumanın] *adını çəkmir.* Ə.Əbülhəsən.

2. *məc.* Kəsir, nöqsan, çatışmazlıq, biabırçılıq, qeyri-normal hal, iş, vəziyyət. G*ör onda neçə-neçə biabırçılıqların üstü açılar, pərdələr götürülər, eybəcərliklər görünər?* S.Rəhimov. *Vəlini düşündürən bütün eybəcərliyi ilə hiss etdiyi həyat məsələləri idi.* M.Hüseyn.

**EYD** *is.* [*ər.*] *köhn.* Bayram. *Baxmayın eyd günü ayna ilə ayə, vəli; Mahi-nov ol iki əbruyi-dütadən görünür.* Ə.Vahid.

**EYDİRMƏ** 1. "Eydirmək"dən *f.is.*

2. *is.* İnəyi sağarkən onu oxşamaq üçün oxunan mahnı. *Eydirmə oxumaq. – Kimdir o qaragöz ellər gəlini? Dilində eydirmə inəkmi sağır?* S.Vurğun. *Biz əvvəlcə buzovun boğazına ipi salıb bağlayırıq inəyin qabaq ayağına. Sonra da bir-iki ağız eydirmə deyib, başlayırıq məmələrin hansı qabaqca əlimizə düşsə, dartışdırmağa.* İ.Hüseynov.

**EYDİRMƏK** *f.* İnəyi sağmazdan əvvəl onun əmcəklərini südlə dolsun deyə, iki barmaqla sıxmaq və ya balasını azca əmizdir-

mək. ..*Ruqiyyə inəkləri eydirirdi, mən də sağırdım.* A.Divanbəyoğlu.

**EYHAM** *is.* [*ər.*] İkimənalı, üstüörtülü söz və ya ifadə; işarə. *Bir otaqda oturuban biz ilən; Könlümü aldığın şirin söz ilən; Gah eyham, işarə, gah göz-qaş ilən; Gah həzin güftguyun istərəm.* Q.Zakir. *Həsən ağanın rəngi dəyişir: – Nə demək istəyirsən, bu eyhamların mənası nədir?* Ə.Haqverdiyev. *Nərgiz xanım düşünür: yazıq Azad, Ulduz mənim qızımdırsa, o sənin bu eyhamını çox çətin başa düşəcək..* Ə.Məmmədxanlı. ☐ **Eyham atmaq (vurmaq, etmək)** – kinayəli, üstüörtülü söz demək, işarə vurmaq. [Ələkbər:] *Sən Səlimnaz xanıma eyham atırsan?* N.Vəzirov. *Kürən at xatakar olar ha.. – deyə Nadir nəyə isə eyham etdi..* B.Talıblı. *Sabir yenə qımışdı. O, belə eyhamlar vurduqca Məşədi bəyin xoşuna gəldiyini çox aydın hiss edirdi.* M.Hüseyn. **Eyhamla danışmaq (demək)** – danışarkən üstüörtülü, eyhamlı sözlər işlətmək, işarə ilə danışmaq. *Eyhamla, işarə ilə danışdığı, Maralın nə isə bir şey duyduğunu sübut edirdi.* Ə.Əbülhəsən. *Xanpəri "Həcərin qızı Gülşən xanım" sözlərini çox eyhamla, bəlkə də istehza ilə demişdi.* Ə.Vəliyev.

**EYHAMLI** *sif.* Üstüörtülü, ikimənalı. *Eyhamlı söz. Eyhamlı baxış. – Kərim kişinin eyhamlı danışması, Kazımın qocanın üstünə qışqırması, Kosaoğlunun ərizəni cırıb kişini idarədən qovması İmranın yadından çıxmırdı.* İ.Şıxlı.

**EYHAMSIZ** *zərf.* Eyhamlar işlətmədən, kinayəsiz, açıq. *Eyhamsız danışmaq.*

**EYHANA** *ara s. dan.* 1. Birdən, olmaya, olmaya-olmaya, işdir. *Qız başladı fikir eləməyə ki, eyhana, bu adamlar bilsə ki, İbrahim yoxdu, mən burda təkəm, görəsən, başıma nə gələr?* (Nağıl). [Aftil:] *Bir də, eyhana, adamdır, işdir, gecə qapını döyən oldu, məbada açasınız.* C.Cabbarlı.

2. Hərgah, əgər, şayəd. *Eyhana gəlsə, sözlərimi ona çatdır.*

**EY-HAY** b a x **ay-hay.** *O dedi: – Ey-hay, hara gedirəm, mənim qardaşım bura gəlib.* (Nağıl).

**EYİ** *sif. köhn.* Yaxşı. [Kərəm:] *Bir igid düşərsə, qaldıran olmaz; Eyi iş görənə pis demək olmaz.* "Əsli və Kərəm". [Turxan bəy:] *Nə eyi təsadüf!* [Aşıq Sultanın] *saz çalmasını və dəyərli aşıq sözlərini çoxdan bəri eşitdiyim yox.* H.Cavid. [Xədicə] *olduqca xoşsöhbət, eyi təbiətli, genişqəlbli, munis və mehriban bir qız idi.* S.Hüseyn. // Zərf mənasında. *Ağasəfər özlüyündə qət etmişdi ki, .. türkcə də, rusca da mən çox eyi bilirəm.* Ə.Əbülhəsən.

**EYİB** *is.* [*ər.*] 1. Utanılacaq hal və ya hərəkət; nöqsan, kəsir, qüsur. *Bundan əlavə, dəxi Yusif şahda həzar gunə özgə eyiblər tapdılar.* M.F.Axundzadə. *Eybimizi çulğalamışdı aba; Hər nə gəlirdi boşalırdı qaba.* M.Ə.Sabir. *Həqiqət, ər və arvad Bahadıra nəinki bir eyib tapmırdılar, hətta onu sevirdilər.* N.Nərimanov. ☐ **Eyib etmək** – eyib sanmaq, eyib tutmaq, eyibləndirmək, utandırmaq, qüsur tutmaq. *Gül yanağın həsrətindən ağlasam eyb etmə, kim; Bülbüli şövqündə giryan şol gülixəndan edər.* Nəsimi. *Gözüm yaşı gündən-günə fərq elər; Eyb etməyin, məni qana qərq elər.* M.V.Vidadi. **Eybini açmaq** – ifşa etmək, eybini, nöqsanını açıb göstərmək.

2. Utanılmalı, xəcalət çəkilməli. *Eyib söz. Eyib iş.*

◊ **Eybi yox(dur)** – 1) razılıq bildirir. *Sən zəlil ol, eybi yox, qoy güclü çəksin ləzzəti; Qoy səni xar eyləsinlər xanü əyan, qəm yemə!* M.Ə.Sabir. *Eybi yoxdur, mən sizin səadətiniz uğrunda iqbalımı bir daha sınaram.* M.S.Ordubadi; 2) ziyanı yoxdur, fikir etmə (təsəlli bildirir). [Ceyran xala:] *Eybi yoxdur, oğul! Ümidini itirmə. Mənim qızım dəyanətli qızdır.* S.Rəhman. **Eybinə gəlmək** – özü üçün eyib saymaq, utanmaq, sıxılmaq, xəcalət çəkmək. [Ömər:] *Doğrusu, mənim eybimə gəlir deyəm.* N.Nərimanov. *Eybinə gəlir ki, bu sözləri dilinə gətirirsən?* Ə.Vəliyev. **Eybinə kor olmaq** – öz eybini, qüsurunu, nöqsanını bilib utanmaq, xəcalət çəkmək. *Ey zahidi-xudbin, yürü, öz eybinə kor ol!* S.Ə.Şirvani. *Elə bu başla zavod saxlayırsan? Eybinə kor olmaq əvəzinə, hökuməti borclu çıxarırsan?* Ə.Vəliyev. **Eybini üzünə demək** – çəkinmədən birinin nöqsanını, qüsurunu açıb özünə söyləmək. **Eyib də olsa** – söylənilməsi eyib sayılan bir sözü

dedikdə, hörmət, nəzakət gözləmək məqsədi ilə işlənən ifadə. [Hacı:] *Xeyirdir, inşallah! Mənim, eyib də olsa, evdə bir yetişmiş qızım var, iki aydır ki, xəstə yatır.* R.Əfəndiyev. [Səriyyə xala qoca pinəçiyə:] *..Bəlkə sən biləsən, eyib də olsa, kişinin adı Musadır, oğlanın da Firidun?..* M.İbrahimov. **Eyib etməz (eləməz)** – b a x **eybi yox(dur)**. [Gülməmməd:] *Eyib etməz, ağlama, canımız sağ olsun, biz ölməmişik.* M.Əliyev. [Vaqif Ağaməmməd Qacara:] *Eyib etməz, sizə də çatar bir əvəz; Qatır cinsisiniz, doğub-törəməz.* S.Vurğun. **Eyib içində olmaq** – çox nöqsanlı, qüsurlu olmaq. *Özü eyib içində olduğu halda, başqalarına irad tutur.* **Eyib olsun!** – danlama ifadəsi. [Rüstəm bəy:] *..Həsənqulu bəy, Rza bəy, sizin üçün eyib olsun ki, bu cürə axmaq sözə inanıb mənim qapıma gəlirsiniz.* Ü.Hacıbəyov. **Eyib yerlər** – bədənin məhrəm yerləri. **Nə eybi (var)** – eyib etməz, eybi yoxdur, zərəri yoxdur; nə zərəri. *Gər yar üçün əğyari tutum dust, nə eybi; Gül xatirinə eyləmişəm xarə məhəbbət.* S.Ə.Şirvani. *Hər bir ana dilini danışmaq ilə keçmişdəki gözəl günləri yad etməyin nə eybi var?!* C.Məmmədquluzadə.

**EYİBCU** *is.* [*ər.* eyb və *fars.* ...cu] *klas.* Hər kəsdə eyib, nöqsan axtaran, hər şeydə irad tapmağa çalışan adam. *Key şux! Nədir bu güftügulər? Qılmaq sənə tənə eybculər.* Füzuli. *Könlünü badəpərəst olmağa mötad edəsən; Eybcu olma, əfəndim, sənə hər an demədim?!* Ə.Vahid.

**EYİBLƏMƏ** "Eyibləmək"dən *f.is.*

**EYİBLƏMƏK** *f.* Pis, nalayiq, eyibli bir hərəkət üçün birini qınamaq, danlamaq.

**EYİBLƏNDİRMƏ** "Eyibləndirmək"dən *f.is.*

**EYİBLƏNDİRMƏK** *f.* Eyib eləmək, danlamaq, qınamaq, təqsirləndirmək. [Şirinnaz:] *Çopurun sağalmasını istədiyi üçün mən onu eyibləndirməməliyəm.* S.Hüseyn.

**EYİBLİ** *sif.* Eybi, nöqsanı, çatışmazlığı, qüsuru olan; nöqsanlı, qüsurlu. *Eyibli adam. Eyibli şey. – Özün insaf elə əfkarına, ətvarına bax; İstəməzsən yazam, öz eyibli kirdarına bax.* M.Ə.Sabir. *Gül-badamın çopuru dərin olsaydı da, üzünü eyibli etməzdi; çünki onun böyük, ala, uzun kirpikli gözləri üzündə tamam eybini örtürdü.* N.Nərimanov. *Axı heç kəs başqalarını yanında eyibli* (*z.*) *görünmək istəmir. M.İbrahimov.*

**EYİBSİZ** *sif.* Heç bir eybi, nöqsanı, qüsuru olmayan. *Eyibsiz dost axtaran dostsuz qalar.* (Ata. sözü). *Dağ başında iz olmaz; Dərə-təpə düz olmaz; Yarın boyu gödəkdir; Gözəl eyibsiz olmaz.* (Bayatı). *Bir surət zahirdə nə qədər düzgün, eyibsiz və qüsursuz olsa da, onda ağlın nuru təcəlla etməsə, .. o surət könülalıcı və fərəhgətirici ola bilməz.* F.Köçərli.

**EYİBSİZLİK** *is.* Heç bir eybi, nöqsanı, qüsuru olmama; nöqsansızlıq, qüsursuzluq. [Məşədi İbad:] *İndi bilmişəm ki, mənim bir eybim varsa, o da eyibsizliyimdir.* Ü.Hacıbəyov.

**EYİCƏ** *zərf köhn.* Yaxşıca. *Eyicə yaşamaq. Eyicə dolanmaq.*

**EYİLƏŞDİRİLMƏ** "Eyiləşdirilmək"dən *f.is.*

**EYİLƏŞDİRİLMƏK** *məch. köhn.* Yaxşılaşdırılmaq.

**EYİLƏŞDİRMƏ** "Eyiləşdirmək"dən *f.is.*

**EYİLƏŞDİRMƏK** *f. köhn.* Yaxşılaşdırmaq.

**EYİLƏŞMƏ** "Eyiləşmək"dən *f.is.*

**EYİLƏŞMƏK** *f. köhn.* Yaxşılaşmaq, daha yaxşı olmaq. [Rauf:] *İnşallah, az bir zamanda sağalıb eyiləşərsən; Fəqət bir daha mətbəədə çalışmayacağına əminim.* H.Cavid.

**EYİLİK** *is.* Yaxşılıq. [Aşıq Sultan:] *Fənalıq, eyilik bil nə deməkdir; Yarın adın dastan olur dillərdə.* H.Cavid.

**EYLƏ** b a x **elə**. *Üzülür sərasər riştеyi-canım; Eylə ki, zülfünə darağı çəkər.* Q.Zakir. *Eylə bildim ki, dəxi sübh olub; Mürği-səhər tək bir ağız banladım.* M.Ə.Sabir.

**EYLƏMƏ** "Eyləmək"dən *f.is.*

**EYLƏMƏK** "Etmək" felinin üslubi variantı. *Eşq sövdasından, ey naseh, məni mən eylədin; Yox imiş əqlin, mənə yaxşı nəsihət vermədin.* Füzuli. *Hər tərəf xain edir zülm; Eyləyir xəlqi həsrəti-tale.* C.Cabbarlı.

**EYMƏ** *is. məh*. İçində qatıq, ayran və s. saxlamaq üçün qoyun və ya keçi dərisindən torba. *Çatdılar obaya, ey qatıq satan; Hər eyməyə tökmüşdülər üç qazan.* Q.Zakir. *Həmişə mal-qara örüşdən qayıdanda həyətə çıxıb, əli belində, qulluqçulara göstəriş ve-*

*rən, inəklərin südünü bir yana yığdırıb eyməyə çəkdirən .. Zərnigar xanım indi yerindən tərpənmədi.* İ.Şıxlı.

**EYMƏAĞIZ** *sif. dan.* Ağzı yekə, yekəağız. *Eyməağız adam.*

**EYMƏÇ** bax **eymə**.

**EYMƏÇİ** *is.* Eymə düzəldən, eymə ustası. *Eyməçiyə doşab göstərməzlər.* (Ata. sözü).

**EYMƏLİK** *sif. köhn.* Eyməyə yarar. *Eyməlik dəri.*

**EYMƏN** *sif.* və *zərf* [*ər.*] *klas.* Arxayın, qorxusuz, təhlükəsiz, salamat. *Yanan eşq atəşinə atəşi-duzəxdən eyməndir.* Füzuli. *Hər bir cani, qantökən, yolkəsən ki, divan əlindən qaçıb onun evinə girməyi özünə mümkün elərdi, daha hər bir divan siyasətindən özünü eymən hesab edərdi.* Ə.Haqverdiyev.

**EYMƏNMƏ** "Eymənmək"dən *f.is.*

**EYMƏNMƏK** *f.* Qorxmaq, vahiməyə düşmək, xoflanmaq. *Qaranlıqdan eymənmək.* – [Yazgül:] *Ay ana, mən də eyməndim, bəlkə xoxanmış.* Ə.Məmmədxanlı. *Əhməd ətrafına baxdıqca minlərcə insan görür kimi eymənirdi.* Ə.Vəliyev.

**EYN** *is.* [*ər.*] *klas.* Göz. *Axdı eynim yaşı, döndü sellərə; Yar için sulara qarışdımı ola?* Aşıq Dilqəm. *Müddətdir eynindən cida düşmüşəm; Həsrətini çəkər hər zaman Pəri!* Aşıq Pəri. ..[Qəhrəman] *düşündükcə ötən günləri xatırlayır, eynində atasının uzun yamaqlı arxalığı .. canlanırdı.* S.Rəhimov.

◊ **Eyni açılmaq** – halı yaxşılaşmaq, kefi yaxşılaşmaq, üz-gözü açılmaq, gümrahlanmaq, dilxorluğu, kəsaləti keçmək. [Usta Murtuz Əkbərə:] *..Dur əl-üzünü yu, eynin açılsın, yatdıqca ağırlaşırsan.* Mir Cəlal. *Axşam kənddə əl-ayaq yığılan vaxt Qədir oyandı. Soyuq su ilə yuyunandan sonra eyni açıldı.* Ə.Vəliyev. **Eyninə deyil** – vecinə gəlmir, saymır, təsirlənmir. **Eyninə gəlməmək (girməmək)** – vecinə gəlməmək, vecinə almamaq, əhəmiyyət verməmək, saymamaq, təsirlənməmək. *Olsa yüz üzü gül, girməz eynimə; Mən ancaq bir gülüzarə aşiqəm.* M.P.Vaqif. *Top gülləsinin qabağında səngərə girən, çuxura, daş dalına soxulan, qazmaya girib gizlənən kim? Amma mən? Eynimə gəlmədi.* Ə.Əbülhəsən.

**EYNƏK** [*ər.* eyn və *fars.* ...ək] bax **gözlük**. [Yarməmməd] *gözünə eynək taxıb stolun dalında oturmuşdu.* M.İbrahimov. *Tahir sümük çərçivəli eynək taxmış ucaboy, buğdayısifət, qıvrımsaç alimi yaxşı xatırlayırdı.* M.Hüseyn. *..Sonanın atası başında təsək, gözlərində eynək olduğu halda .. məcmuələrdən cürbəcür məlumatlar oxuyardı.* Ə.Əbülhəsən.

**EYNƏKÇİ** bax **gözlükçü.**

**EYNƏKLİ** *sif.* Gözlüklü, gözlük taxmış. *Eynəkli adam.* – *..Görürsən müsəlmanlar yığışıblar bir dükanın qabağına və qulaq asırlar, ortada bir gözü eynəkli şəxs əlində bir kağız tutub oxuyur.* C.Məmmədquluzadə.

**EYNƏN** [*ər.*] bax **eyni ilə** ("**eyni**"də). *Sonra Dəmirovun xəyalında həkim məntəqələri eynən canlanırdı.* S.Rəhimov. *Bu hinin yastı damında eynən mənim vurduğuma bənzər iki göyərçin gəzinir.* M.Rzaquluzadə.

**EYNİ** *sif.* Bir-birinə tamamilə oxşar, bir cür, tam bənzər; oxşarı, tayı, bənzəri, tamamilə özü. *Qarı qollarını çırmalayıb, Məlik vəzirin arvadını doğuzdurdu, gördü ki, bu bir oğlan doğdu ki, eyni Yusifi-Kənan.* (Nağıl). *Sən varlığın eynisən, buna sözmü var? Ürəyisən, beynisən, buna sözmü var?* M.Müşfiq. // Başqası yox, həmin, bəlli şeyin özü. *Eyni yer. Eyni söz.* – *..Fərhadoğlu yenə də sabah-sabah eyni mətləbdən söz açmalı oldu.* S.Rəhimov. □ **Eyni ilə** – 1) tamamilə eyni, tamamilə olduğu kimi, tam oxşar. *Keçən aylarda da bir dəfə Cuma evinə eyni ilə belə gəlmişdi.* Ə.Əbülhəsən; 2) hərfi-hərfinə, sözü-sözünə, nöqtəsi-nöqtəsinə, necə ki var, əslində olduğu kimi. *Eyni ilə köçürmək.* – *Mərhumun* [M.F.Axundzadənin] *tərcümeyi-halına dair yuxarıda icmalən verdiyimiz əhvalata iktifa etməyib, onun öz yazdığı təfsilatı fars dilindən türkcə tərcümə edib, necə ki var, eyni ilə burada zikr edirik.* F.Köçərli. **Eyni zamanda (vaxtda)** – 1) bir vaxtda, bir zamanda. *Eyni zamanda iki otaqda mühakimə gedirdi.* Mir Cəlal. *Qırx .. şahmatçı ilə eyni zamanda oynayırdı.* İ.Əfəndiyev; 2) həmçinin, bununla bərabər. *Yaxın zamanda Bağdad dünyasına məşhur oxuyan, eyni zamanda misli görünməyən bir gözəl qədəm qoyacaqdır.*

M.S.Ordubadi. [Qəhrəman:] *Eyni zamanda* [xanımın] *əlindən yaxa qurtarmaq üçün çalışırdım.* H.Nəzərli.

**EYNİADLI** *sif.* Başqası ilə eyni adı daşıyan, eyni adı olan. *Eyniadlı romanın motivləri əsasında çəkilmiş film. Eyniadlı şəhərlər.*

**EYNİADLILIQ** *is.* Eyni adda olma, eyni adı daşıma. *Bir şəhərdə küçələrin eyniadlılığı böyük çətinliklərə səbəb olur.*

**EYNİBİÇİMLİ** *sif.* Bir biçimdə olan, bir cür. *Eynibiçimli paltar.*

**EYNİBİÇİMLİLİK** *is.* Bir biçimdə, bir ölçüdə olma.

**EYNİCİNSLİ** *sif.* Bir cinsə mənsub olan, eyni cinsdən olan. *Eynicinsli mallar. Eynicinsli maddələr.*

**EYNİXASİYYƏTLİ** *sif.* Başqası ilə eyni xasiyyətdə olan, xasiyyətcə oxşar, bir cür, eyni. *Eynixasiyyətli cisimlər.*

**EYNİQİYMƏTLİ** *sif.* Bir qiymətdə, başqası ilə eyni qiymətdə olan. *Eyniqiymətli şey.*

**EYNİQİYMƏTLİLİK** *is.* Bir qiymətdə, başqası ilə eyni qiymətdə olma.

**EYNİLƏŞDİRİLMƏ** "Eyniləşdirilmək"dən *f.is.*

**EYNİLƏŞDİRİLMƏK** *məch.* Eyni şey hesab edilmək, tamamilə oxşadılmaq, bərabər tutulmaq.

**EYNİLƏŞDİRMƏ** "Eyniləşdirmək"dən *f.is.*

**EYNİLƏŞDİRMƏK** *f.* Eyni şey hesab etmək, tamamilə oxşatmaq, bənzətmək, bərabər tutmaq. *Məfhumları eyniləşdirmək.*

**EYNİLƏŞMƏ** "Eyniləşmək"dən *f.is.*

**EYNİLƏŞMƏK** *f.* Tamamilə oxşamaq, bənzəmək, bir cür olmaq, eyni şəkil, eyni forma almaq.

**EYNİLİK** *is.* Tamamilə oxşarlıq, tamamilə bənzərlik, bir-birinin eyni olma. *Görüşlərin eyniliyi. – Lakin yelləncək sürətlə qalxıbendikcə Veysin fikirlərində də elə bil eynilik artırdı.* Ə.Əbülhəsən.

**EYNİMƏ** "Eynimək"dən *f.is.*

**EYNİMƏK** *f. məh.* Yaxşılaşmaq, əmələ gəlmək. *..Gülqədəmi əməndən sonra uşaq əməlli-başlı eyniməyə başladı.* Ə.Vəliyev.

**EYNİMƏNALI** *sif.* Mənaca eyni olan, mənaları bir olan, başqası ilə bir mənada olan. *Eynimənalı söz. Eynimənalı ifadə.*

**EYNİYAŞLI** *sif.* Bir yaşda, eyni yaşda olan; yaşıd. *Eyniyaşlı uşaqlar. Eyniyaşlı qızlar.*

**EYNİYAŞLILIQ** *is.* Bir yaşda, eyni yaşda olma; yaşıdlıq.

**EYNİYYƏT** *is.* [*ər.*] 1. Tam oxşarlıq, tam bənzərlik; oxşayış, bənzəyiş, eynilik, bir şeyin digərinə eyni ilə müvafiq olması. *Qəzet, kitabdan da gəlmişik cana; Eynidir cümlə də, eynidir söz də; Eyniyyət içində ürək bir yana; Vallahi, yoruldu gözlərimiz də.* B.Vahabzadə.

2. Riyaziyyatda: bütün hallarda ədədi qiymətlərin bərabərliyi.

**EYNİZAMANLILIQ** *is.* Bir vaxtda, bir zamanda olma; bir vaxta, eyni vaxta düşmə (təsadüf etmə).

**EYŞ** *is.* [*ər.*] Kef, zövq-səfa, ləzzətli həyat. *Dövlətliləriz, məqsədimiz eyşü səfadır; Mehmanlarımız büsbütün ərbabi-qinadır.* M.Ə.Sabir. *Yoxsullar boğulurkən; Bu qanlı, yaslı vayda; Xaqan dalmışdı eyşə; Bağlardakı sarayda.* Ə.Cavad. [Xanlar] *badələri qaldırıb, bir-birinə mədhlər deyib eyşi davam etdirirdilər.* S.Rəhimov. ☐ **Eyş etmək** – kef çəkmək. *Gülşəndə, Seyyid, içdim o şirinləb ilə mey; Eyş eylədim çəməndə bu gün xosrovanə mən.* S.Ə.Şirvani.

**EYŞ-İŞRƏT** *is.* bax **eyş** (bəzən "və" bağlayıcısı ilə). *Eyş-işrət məclisi. Eyş-işrətdən başı ayılmır. – Güldü gül, açıldı nərgis, lalə doldu jalədən; Ey, xoş ol kim, eyşü-işrət etməyə əsbabı var.* Füzuli. *Naməlsəm məhəlləsinin camaatı ata-babadan yerli, tavanalı olub, günlərini müttəsil eyş və işrətdə keçirən bir xalq idi.* N.Nərimanov. *Nə qədər əlində dövlət var idisə, Əmiraslan Gülpəriyə yaxın durmurdu. Amma elə ki var-yoxunun hamısı eyş-işrətə qoyulub puç oldu, Gülpərini almaq fikrinə düşdü.* S.S.Axundov.

**EYŞ-İŞRƏTLİ** *sif.* Eyş-işrət olan, kef çəkilən. *Eyş-işrətli məclis.*

**EYVAY** *nida.* 1. Kədər, ağrı, təəssüf kimi hissləri bildirir. *Dedim*: *eyvay, halım yaman olubdur; Dedi*: *qəmdən belim kəman olubdur.* Qurbani. *Xabi-qəflətdən oyan, hay könül, hay könül; Könül, eyvay könül, vay könül, ey vay könül*. Kişvəri.

2. Çağırış, müraciət, yalvarış məqamında işlənir. *Bir çoban bir gün etdi dağda haray!*

*Canavar var, – dedi, – gəlin, eyvay!* M.Ə.Sabir.

**EYVAH, EYVAH Kİ** *nida.* Əfsus, heyhat, heyif (ki). *Fərat aşdı başımdan və leyk mən təşnə; Yaxıbdır odlara, eyvah, aşiqanə məni.* S.Ə.Şirvani. [Orxan:] *Od-alov saçmadan qəhrəman Səlim; Eyvah, demək, son nəfəsimdir mənim.* H.Cavid.

**EYVAN** *is.* Adətən evin, otağın, ya otaqların ön tərəfində, üstüörtülü, qabağı açıq balkon; seyvan. *Məşuqə eyvanın bağa tərəf baxan küncünə gəlib gözləməyə başladı.* S.Rəhimov. *Həmin günün axşamı Pərşan öz evlərində Qaraşı eyvanın o başına çəkib əhvalatı nəql etdi.* M.İbrahimov.

**EYVANLI** *sif.* Eyvanı olan. *Eyvanlı ev.* – *İmamverdi babanın həyətində iki tikilisi vardı. Biri köhnə daxma idi, o biri də iki otaq və mətbəxli, qabağı eyvanlı təzəcə ev idi.* S.S.Axundov. *Qabaqda eyvanlı bir ev görünür; Baxdıqca sevincdən ürək döyünür.* Z.Xəlil.

**EYVANSIZ** *sif.* Eyvanı olmayan. *Eyvansız ev.*

**EYZƏN** *sif.* və *zərf* [*ər.*] Tamam, bütün, başdan-başa. *Məcməidə düzülmüş, eyzən xuruş sərasər.* M.Ə.Sabir. [Asya:] [Gülçöhrə] *eyzən fikirdə, kefsiz, dinməz, yəqin burada bir hikmət vardır.* Ü.Hacıbəyov. [Turac:] *Kitabda yazılan sevgilərin axırı eyzən dava-şava olur.* İ.Əfəndiyev.

**EZAM** *is.* [*ər.*] Xidməti və ya başqa bir iş üçün bir yerdən başqa yerə göndər(il)mə, yolla(n)ma. *Katib uşağın adını yazdı, ona kağız verib maarif komissarlığına, qəbul və ezam komisyonuna göndərdi.* Mir Cəlal. *Bu zaman Bəhram müxtəlif kitablarla dolu çamadanını təşkilat şöbəsinin pəncərəsinə qoyub, ezam vərəqəsini şöbə müdirinə təqdim etdi.* Ə.Vəliyev. ◻ **Ezam edilmək (olunmaq)** – müəyyən bir iş və ya tapşırıqla əlaqədar olaraq bir yerə göndərilmək, yollanmaq. *Ümumiyyətlə, Nemətullayev ezam olunmağı çox xoşlar, rayona mal yeritməklə məşğul olar və bununla da özünü ticarəti bilən, nadir bir adam kimi gözə verərdi.* S.Rəhimov. **Ezam etmək** – müəyyən bir iş və ya tapşırıqla əlaqədar olaraq bir yerə göndərmək, yollamaq. *Yunis öyrəndi ki, Moskva məktəblərinə ezam edən xüsusi komisyon var.* Mir Cəlal.

**EZAMİYYƏ** [*ər.*] 1. Bax **ezamiyyət**. *Ezamiyyə pulu. Ezamiyyə vərəqəsi.*

2. Ezamiyyət kağızı (vəsiqəsi).

**EZAMİYYƏT** *is.* [*ər.*] Xidməti və ya başqa bir işi, tapşırığı yerinə yetirmək üçün bir yerə ezam olunma, getmə. *Ezamiyyətə getmək. Ezamiyyətdən qayıtmaq.* – [Yunis] *ərizə və ezamiyyət kağızını çıxarıb göstərdi.* Mir Cəlal.

**EZAMİYYƏTÇİ** *is.* Xidməti bir iş üçün bir yerə göndərilmiş adam, ezamiyyətdə olan adam. [Almaz] *gələn adamın .. ezamiyyətçi olduğuna inansa da, yenə baxırdı.* Mir Cəlal.

**EZOP**: **Ezop dili** [qədim yunan təmsilçisi Ezopun (Aisopos) adından] *dilç.* – üstüörtülü, müəmmalı, rəmzli dil. *Ezop gedib, dili qalıb; Dünyanın min bir müşkülü qalıb.* R.Rza.

# Əə

**Ə**[1] Azərbaycan əlifbasının yeddinci hərfi və bu hərflə işarə olunan saitin adı.

**Ə**[2] *nida.* Müraciət, çağırış bildirir. [Nəbi] *pristav Mehdi bəyi görcək deyir: – Ə, bu fağırı niyə qəhr edirsən?* "Qaçaq Nəbi". [Ələmdar Qoltuqçuya:] *Ə, kişisən, mən ölüm, bu tufanda məni dara qısnama!* S.Rəhimov. [Nəbi:] *Ə, olmaya Növrəstədən yana bir söz eşitmisən?* Ə.Abasov. // Bəzən cümlənin axırına gətirilir. [Abbas:] *Bə, cəmdəklər niyə xarab olmayıb, ə?..* İ.Hüseynov.

**ƏBA** bax **aba**[1]. *..Axund əbasını düzəldib dükandan çıxdı, getdi.* C.Məmmədquluzadə. *Şeyx Şaban .. otuz il bir əbayla gəzməyi, qırx il bir kürkə bürünməyi qəbul edərdi.* Ə.Haqverdiyev. [Fərəc:] *Səsim var, saqqalım var, farsca qəzəl bilirəm; pulum da var ki, əba, çarıq və qurşaq alım.* Qantəmir.

**ƏBALI** bax **abalı**. *Görünür* [Mirzə Poladın] *Şuşadakı həkim atası – sarı əbalı Mirzə Həsən öz qızına çox əfsanəli, əsrarlı bir dərs demişdir.* S.Rəhimov.

**ƏBABİL** *is.* [*ər.*] Dağ qaranquşu, uzunquyruq.

**ƏBCƏD** *is.* [*ər.*] *köhn.* 1. Qədim ərəb əlifbasında ilk dörd hərf. (hərfləri mexaniki olaraq əzbərləmək üçün işlədilirdi). *Bular gərək hələ "əbcəd"də hıqqana "qərəşət"də; Kitabi-elmi oxurlar rəvan bu boyda, bu boyda!* M.Ə.Sabir. *Bu qayda ilə molla əbcəd, həvvəz, hütti ləfzlərini "təhlil" edib, mənə bunları hazırlamağı əmr etdi.* T.Ş.Simurq. *Molla köməkçisi .. Əvəz xəlfəni çağırıb dedi: – Apar, buna əbcəd, həvvəzi öyrət.* C.Cəbrayılbəyli.

2. Ümumiyyətlə, keçmişdə "əlifba" mənasında işlənmişdir. // *məc.* İbtidai bilik, savad. ☐ **Əbcəd hesabı** – müəyyən bir tarixi və ya rəqəmi ərəb hərfləri vasitəsilə ifadə etmək üsulu. *Aşıqlıq elmində nadir pərgarın; Əbcəd hesabından varmı xəbərin?* Şair Vəli.

**ƏBD** *is.* [*ər.*] *köhn.* Qul, kölə. *Əbd olma, ey Nəsimi, fani cəhanə, çün kim; İmanü din içində sənsən əmirü sultan.* Nəsimi.

**ƏBƏ**[1] *is. məh.* Uşaq oyununda: içərisinə qoz, fındıq və s. salınan çuxur.

**ƏBƏ**[2] *is. dan.* Mama, mamaça.

**ƏBƏÇİ** *sif. məh.* Mamaça, mama. *Pis əbəçiyə arvad tapşıran övladsız qalar.* (Ata. sözü).

**ƏBƏÇİLİK** *is. məh.* Mamaçalıq, mamalıq. *Əbəçilik etmək.*

**ƏBƏD** *zərf* [*ər.*] Sonsuz gələcək zaman (*əzəl* qarşılığı). // Əbədi, həmişəlik. *Oxuyun, millətin nicatı olun; Ta əbəd baisi-həyatı olun.* M.Ə.Sabir.

**ƏBƏDA** [*ər.*] *klas.* 1. Bax **əbədən**.

2. Heç, qətiyyən. *Əbəda yox bu işdə imkanım; Deyil onlar mütii-fərmanım.* M.Ə.Sabir.

**ƏBƏDƏN** *zərf* [*ər.*] Heç vaxt, heç bir zaman, əsla, qəti, qətiyyən. *Mənim nə borcumdu ki, məvacibiniz az, zəhmətiniz həddən artıq və rahətliyiniz əbədən yoxdur.* C.Məmmədquluzadə. *Demək istəmiş ki, səbr edən insan; Dünyadan əbədən üzülüşübdür.* B.Vahabzadə.

**ƏBƏDİ** *sif. və zərf* [*ər.*] 1. Daimi, həmişəlik. *Şair könlüm rübabını eşq ilə çaldı; Biz əbədi qardaş olduq: ilk bahar və mən.* S.Vurğun. *Sübhün əbədi aşiqləri olan boz torağaylar havalanıb səhər nəğmələrini oxuyur..* M.Rzaquluzadə. // Ölməz, daim yaşayan. *Bu odlu nəğmələrdən; Parlaq, sönməz bir məşəl; Bu rəngin lövhələrdən; Qur əbədi bir heykəl.* A.Şaiq. *Mən elə bildim ki, ürəyim acdır; Məhəbbət əbədi bir ehtiyacdır.* S.Vurğun. // Sonsuz, intəhasız, mütləq.

2. Bax **əbədən**. *Əbədi bizə gəlməyib. Əbədi xəbərim yoxdur.*

◊ **Əbədi istirahət evi** *tənt.* – qəbir. **Əbədi yuxu** – ölüm. *Afaq dodaqlarında təbəssüm, ölüm adlanan əbədi bir yuxu içində idi.* Ə.Məmmədxanlı. **Əbədi yuxuya getmək, gözlərini əbədi yummaq, əbədi susmaq** – ölmək, keçinmək. *Qız tab eləməyib, yerə dəydi, .. əbədi olaraq susdu.* T.Ş.Simurq. *Neçə gündür ki, şanlı Bakı əbədi yuxuya gedən xalq şairinə öz kədərli köksündə layla çalır.* S.Rəhimov.

**ƏBƏDİLƏŞDİRİLMƏ** "Əbədiləşdirilmək"dən *f.is. Qarabağ müharibəsində həlak olan qəhrəmanların xatirələrinin əbədiləşdirilməsi.*

**ƏBƏDİLƏŞDİRİLMƏK** *məch.* Əbədi olaraq yaşadılmaq, yadda saxlanılmaq.

**ƏBƏDİLƏŞDİRMƏ** "Əbədiləşdirmək"-dən *f.is.*

**ƏBƏDİLƏŞDİRMƏK** *icb.* 1. Əbədi olaraq nəsillərin xatirəsində yaşatmaq, həmişəlik xatirə qoymaq. *Xalq öz qəhrəmanlarının xatirəsini əbədiləşdirmək üçün onlara abidə ucaldır.*

2. Həmişəlik etmək, əbədi hala salmaq, daimi etmək. *O sonsuz eşqini, böyük arzunu; Öz ana dilində əbədiləşdir.* B.Vahabzadə.

**ƏBƏDİLƏŞMƏ** "Əbədiləşmək"dən *f.is.*

**ƏBƏDİLƏŞMƏK** *f.* Əbədi olmaq, həmişə yaşamaq. *Eşqinə dəm tutub göylər mələşsin; Eşqin tarix olub əbədiləşsin.* B.Vahabzadə.

**ƏBƏDİLİK** *is.* Daimilik, sonsuzluq, həmişəlik, daim yaşama; heç vaxt bitməməzlik, qurtarmamazlıq. *Bu səadət səhəri o qədər zəngin və işıqlıdır ki, başlanan günəşli gündüzün əbədiliyinə şübhə etmirsən.* Mir Cəlal.

**ƏBƏDİYYƏN** *zərf* [*ər.*] Həmişəlik, əbədi, daimi. [Qızın] *gözləri ilk baxışdan əbədiyyən hafizəmdə nəqş olunmuşdu.* Ə.Məmmədxanlı.

**ƏBƏDİYYƏT** *is.* [*ər.*] 1. Əbədilik, daimilik; həmişə var olan şey. [İlyas:] *İlin dəyişməsi qarşımızda, yel vurarkən sönüb dirilən bir şamı andırdığı kimi, insan həyatı da əbədiyyət qarşısında belə bir şeydir.* Çəmənzəminli. *Aç gözünü varlığa bax, indi başqa səhərdir; Əbədiyyət – bu dünyada göstərilən hünərdir.* S.Vurğun. // İntəhası olmayan zaman; intəhasızlıq. *Nəhayət, əbədiyyət qədər uzun görünən bir dəqiqə bitdi və qapını açdılar.* S.Rəhman. *Ulduzun alman əsarətində keçirdiyi bu üç ay ona cəhənnəmi bir əbədiyyət kimi gəlirdi.* Ə.Məmmədxanlı.

2. Sonsuz gələcək zaman. [Ərən:] *İştə, əzəliyyət və əbədiyyət!* Çəmənzəminli. [Fəridə:] *Bütün gözəl musiqilər bizi əbədiyyətə aparır.* Ə.Məmmədxanlı.

◊ **Əbədiyyətə qovuşmaq** – əbədi olmaq. "*Ölüm*" *sözünün nə demək olduğunu bilməyən Girdman igidləri vuruşma meydanında yıxılıb həyatla vidalaşarkən "əbədiyyətə qovuşdu" deyərdilər.* M.Hüseyn. *Vətənin yolunda ölən şəhidlər; Ölmür, qovuşurlar əbədiyyətə.* M.Araz.

**ƏBƏKÖMƏÇİ** bax **əməköməçi.**

**ƏBƏS** *sif.* [*ər.*] 1. Nahaq, bihudə, faydasız. // Zərf mənasında. *Bəslərəm can kimi, ey sevgili sərmayə, səni; Etmərəm sərf əbəs məscidə, mollayə səni.* M.Ə.Sabir. ☐ **Əbəs yerə** – 1) nahaq yerə, boş yerə; lüzumsuzcasına, faydasızcasına. *Əbəs yerə əlləşdim. Əbəs yerə xərcə düşdüm.* – [Hacı Nuru şair:] *..Amma sən əbəs yerə özünü saldın qalmaqala.* M.F.Axundzadə. *Könül, əbəs yerə üzmə canımı; Sonaların əhdə olmaz vəfası.* Q.Zakir. [Pərzad:] *Əbəs yerə, Yusif bəy, arvad sözünə inanma.* N.Nərimanov; 2) əsassız, səbəbsiz, ciddi səbəb olmadan. *Əbəs yerə əsəbiləşmək.*

2. Xəbər şəkilçisi ilə: **əbəsdir** – nahaqdır, faydasızdır, xeyri yoxdur, nəticəsi yoxdur. *Bütün zəhmətlərin əbəsdir. – Söylədi tülkü*: *– Əbəsdir bu xəyal; Məndən ol mərhəməti etmə sual.* A.Səhhət.

**əbəs-əbəs** *zərf* Nahaq yerə. *Əbəs-əbəs neçin qaçırsan məndən; Mən ki zalım, adamyeyən deyiləm.* M.P.Vaqif. *Gül dilləndi*: *"Salmayın səs; Danışmayın əbəs-əbəs".* M.Dilbazi.

**ƏBƏVEYN** *is.* [*ər.*] *köhn.* Ata-ana, valideyn. *Hər gün əbəveyni şad edirlər; Hörmətlərini izdiyad edirlər.* M.Ə.Sabir.

**ƏBİR** *is.* [*ər.*] *klas.* bax **ənbər.** *Gülzarə hava əbir tökdü; Səhrayə qübari-mişk çökdü.* Füzuli.

**ƏBLƏH** *sif.* [*ər.*] 1. Axmaq, səfeh, gic, sarsaq, başıboş. *Əbləh köpək qaysavadan pay umar.* (Məsəl). // İs. mənasında. *Nola bir evdə qoyaydız qaravaş; Verməyəydiz məni bu əbləhə, kaş!* M.Ə.Sabir.

2. Söyüş kimi işlədilir. [Xanım:] *Əbləhin qızı, əbləh, .. gör kimə oxşayır?* Qantəmir. [Zaman:] *Əbləhin qızı, elə bu saat itilərsən gözümün qabağından.* Ə.Haqverdiyev. *Əbləhin biri Kərbəlayı Qubad; İstəyir gələ xanıma kələk.* Ü.Hacıbəyov.

**ƏBLƏHCƏSİNƏ** *zərf* Axmaqcasına, sarsaqcasına, axmaq kimi; gic-gic. *Əbləhcəsinə danışmaq.* // Sif. mənasında. *..Nəsrdə də qafiyədən və uşaqcasına mübaliğələrdən və əbləhcəsinə təşbehlərdən bütünlüklə çəkinəcəklər.* M.F.Axundzadə.

**ƏBLƏHLİK** *is.* Axmaqlıq, səfehlik, giclik, sarsaqlıq. *Əlbəttə,* [Cuma] *bu əbləhliyi üzündən düşmən əlinə keçərək xoşbəxt təsadüflə xilas olmuşdu.* Ə.Əbülhəsən.

**ƏBLƏQ** *sif.* [*ər.*] Ala, ala-bula, ala-bəzək, alaca. *Əbləq at meydanda topla bərabər firlandı.* M.S.Ordubadi.

**ƏBLƏQLİK** *is.* Alalıq, ala-bulalıq, ala-bəzəklik.

**ƏBNA** *is.* [*ər.* "ibn" söz. cəmi] *klas.* Övladlar, oğullar (adətən izafət tərkiblərində işlənir). *Əbnayi-vətən vəqf eləyir vəslinə canın; Həm ruhi-rəvanın.* M.Ə.Sabir.

**ƏBR** *is.* [*fars.*] *klas.* Bulud. *Çün əbr deyilsən, olma giryan! Çün seyl deyilsən, etmə əfğan!* Füzuli. ◻ **Əbri-bahar** – bahar buludu. **Əbri-siyah** – qara bulud. **Əbri-neysan** – yağmur buludu, neysan buludu. *Mən bir sədəfəm, sən əbri-neysan.* Füzuli.

**ƏBRƏŞ** *sif.* 1. Xallı.

2. Əldə bəslənmiş. *O, bu gün palıda düşmüş əbrəş qoçun kababından yemək üçün ayrı bir səy ilə hazırlaşırdı.* S.Rəhimov.

**ƏBRİŞİM** *is.* [*fars.*] 1. İpək, ipək iplik. *Paşa, sənə nişan verim Qıratı; Əbrişim ipəkdən yalı gərəkdi.* "Koroğlu". *Əlvan qanınla boyansın; Əbrişim tellərin sənin!* Aşıq Hüseyn.

2. *bot.* Lələkli yarpağı və ətirli çiçəyi olan ağac növü; akasiya. *Əbrişim .. çətiri piramida şəkilli, otuz metrə qədər hündürlüyündə ağacdır.* H.Qədirov.

**ƏBRU** *is.* [*fars.*] *klas.* Qaş. *Göz doymaz vəsməli kəman, əbrudan; Can üzülmə, səmən iyli keysudan.* M.P.Vaqif.

**ƏBUCƏHL** *is.* [*ər.*] Çox tərs, inadcıl adam haqqında (bəzən söyüş kimi işlədilir). *..Ağa maşının qapısını açdı, dedi: – Düş aşağı, əbucəhl!..* M.İbrahimov.

◊ **Əbucəhl qarpızı** – qarpıza bənzər çox acı yabanı meyvə.

**ƏBYƏZ** *sif.* [*ər.*] *klas.* Bəyaz, ağ. *Ey zülfi siyəh, sinəsi əbyəz, gözü alə; Nə türfə cavansan!* M.P.Vaqif.

**ƏCAİB** *sif.* [*ər.*] 1. Çox qəribə, çox təəccüblü, qeyri-adi, görünməmiş. [Kərəm:] *Yolda bir əcaib milçək görmüşəm, onu sizə sazla deyəcəyəm.* "Əsli və Kərəm". *Əcaib məxluqat görünürdü: kimi buynuzlu və at ayaqlı idi, bəzisi yarıöküz, yarıadam idi.* Çəmənzəminli. *İşarə verildi və kiçik təyyarələr bir-birinin ardınca əcaib rəngarəng quşlar kimi havaya uçdu.* M.Rzaquluzadə. // Zərf mənasında. *Əcaib danışmaq. Belə şeylər adama əcaib görünür.* // *is.* Görünməmiş şey, çox qəribə şey, çox təəccüblü şey, qeyri-adi şey. *Yetim əlində qoğal, əcaib!* (Ata. sözü). *Xət-xət çəkəndə damdı qələmdən; Sinəndəki xaldı, nə əcaibdi!* Qurbani.

2. Heyranedici, misilsiz, xariqüladə, valehedici. *Bu gün bir əcaib gözəl sevmişəm; Beləsi olmaz heç vilayətdə.* M.P.Vaqif.

**ƏCAİBXANA** *is.* [*ər.* əcaib və *fars.* ...xanə] *köhn.* Muzey. *Bir sözlə, doqqaz kəndin əcaibxanası, qəzeti, telefon və teleqrafı idi.* Mir Cəlal.

**ƏCAİB-QƏRAİB** [*ər.*] bax **əcaib** 1-ci mənada. *Sənin kəmalında, fikrin içində; Əcaib-qəraib hallar oynaşır.* Aşıq Pəri. *..Hər kəs bunlardan əcaib-qəraib şeylər nağıl edərdi.* S.S.Axundov. *Əslini-nəslini bilmədiyi o qorxunc həyulalar, əcaib-qəraib məxluqlar* [xanı] *dəhşətə gətirər, bu vahimələr bəzən günlərlə onu narahat edərdi.* M.Rzaquluzadə.

**ƏCAİBLİK** *is.* Əcaib şeyin hal və keyfiyyəti.

**ƏCDAD** *is.* [*ər.* "cədd" söz. cəmi] Ata-babalar, ulu babalar. *Vətən – əcdadımızın mədfənidir; Vətən – övladımızın məskənidir.* A.Səhhət. *Böyük əcdadını gətirib yada; Oynat qılıncını göydə, havada.* S.Rüstəm. *Tariximizin, əcdadımızın əməlləri, arzuları, həsrətləri bu torpaqda hifz olunmuşdur.* Ə.Məmmədxanlı.

**ƏCƏB** *sif.* [*ər.*] 1. *klas.* Təəccüblü, qəribə. *Oğlan, əcəb olmaz, olsa aşiq; Aşiqlik işi qıza nə layiq?* Füzuli.

2. Gülməli, əyləncəli, məzəli, çox qəribə. *Zahida, sən ki bilirsən özünü hal əhli; Bir öz əhvalını bilməzsən, əcəb halın var.* S.Ə.Şirvani. *Əcəb, yoxmu onun bağçası-bağı; Güllərə baxmayır, gül solü sağı.* Ə.Cavad.

3. Çox yaxşı, çox gözəl, əla. *Əcəb şeydir. Əcəb kitabdır. – Bir əcəb qəsrdə tutub mənzil; Meyə olmuşdu ruzü şəb mail.* Füzuli.

*Əcəb əyyam imiş əyyami-sələf; Gərək o günlərdə olaydıq tələf.* Q.Zakir.

4. *dan.* Təəccüb bildirir – görəsən. *Əcəb, nə oldu ki, gəlib çıxmadı?*

5. *dan.* Təsdiq bildirir – bəli, hə. – *Sən yemək yeyəcəksənmi? – Əcəb.*

6. *dan.* İntonasiyadan asılı olaraq təəccüb, narazılıq, bəzən istehza, kinayə bildirir. *Əcəb işə düşdük?! Əcəb bizi avara qoydun! Əcəb adamsan! Əcəb xanəndə imiş! Əcəb işdir! Əcəb intizamlı imişsən!*

◊ **Əcəb eləmək** *dan.* – yaxşı eləmək, əlindən gəlmək. *Bilmirəm, əcəb edirəm, .. sənə nə düşüb?* H.Nəzərli. **Əcəb ki** – nə yaxşı ki, yaxşı oldu ki, nə yaxşı... *Əcəb ki, tez gəldim, yoxsa tamaşaya gecikəcəkdim.* **Əcəb oldu** – yaxşı oldu, elə də lazım idi. *Lütfəli* [Cəlilə] *baxıb öz-özünə deyirdi ki, əcəb oldu.* İ.Musabəyov. **Nə əcəb?** – 1) təəccüb, heyrət, sual bildirir. *Nə əcəb belə gec gəldin?* – [Araz:] *Bir de görüm, sən nə əcəb bura gəldin?* A.Şaiq. *Mənimlə tikdirdiyin qırx üç manatlıq tufliləri nə əcəb geyməyib, belə sarı səndəldə dolanırsan?* Qantəmir; 2) təəccüblü deyil, təəccüblü bir şey yoxdur, buna təəccüb etmə(yin). *Yar söhbətim olmazsa, Füzuli, nə əcəb; Özünə söhbətimi ar bilibdir, bilirəm.* Füzuli. **Sizdən** (**səndən, ondan** və i.a.) **nə əcəb?** – təəccüb, sual məqamında. [Sevil:] *İçəri gəl, ay ata, altı ildir səni görməmişəm, səndən nə əcəb?* C.Cabbarlı. [Rəis:] *Sizdən nə əcəb, Hikmət xanım?* Mir Cəlal.

**ƏCƏBA** *əd.* [*ər.*] *kit.* Sual cümlələrində təəccüb, şübhə, tərəddüd bildirir – görəsən, aya. *Əcəba, bu gün yağış yağacaqmı? Əcəba, onların gəlişindən məqsəd nədir?* – [Yaşlı kişi:] *Əcəba, bu məzarda müalicəpəzir olmayan hər xəstəliyi sağalda biləcək bir kəramət varmıdır?* S.Hüseyn. [Bəhram:] *Əcəba, mən öz əmimin evində xidmətçiyəmmi?* C.Cabbarlı.

**ƏCƏBCƏ** *dan.* b a x **əcəb** 1, 2 və 6-cı mənalarda. *..Bunları mən çox yaxşıca görürəm, çox əcəbcə görürəm, çox qəşəngcə görürəm.* C.Məmmədquluzadə. *Əcəb halın var, ay molla; Əcəbcə ruzigarın var!* Ə.Nəzmi.

**ƏCƏL** *is.* [*ər.*] Hər bir canlının, xüsusən insanın qabaqcadan qədərlənmiş ölüm vaxtı. [Ağamurad bəy:] *Dünyanın işi belə olur. Əcəli bilmək olmaz. Ömürdür, biri az yaşayır, o biri çox yaşayır.* T.Ş.Simurq. // Ümumiyyətlə, ölüm, ölüm çağı. *Keçinin əcəli çatanda çobanın çomağına sürtünər.* (Ata. sözü). [Mehriban] *istəyirdi ki, belə halında, əcəlin soyuq qanadları üzünü oxşarkən Zeynal yatağının yanında, başı üzərində bulunsun.* S.Hüseyn. ☐ **Əcəl girləmək** – b a x **əcəli gəlmək**. [Nemət kişi:] *Görünür, hansı bədbəxti isə əcəl girləyib.* M.Hüseyn. **Əcəli gəlmək (çatmaq, tamam olmaq, yetmək)** – ölüm vaxtı yetişmək. *Əcəl gəldi, başım üstə dayandı; Şirin canım eşqin oduna yandı.* "Aşıq Qərib". *Nə cütü var, nə kotanı, nə kəli; Ölmək istər, yetişməyir əcəli.* A.Səhhət. *Xəstə şəfa tapmayıb öləndə deyərdi*: – *Əcəli yetən adam öləcəkdir, istər həkimi Loğman da ola.* S.S.Axundov. **Öz əcəli ilə ölmək** – təbii ölümlə ölmək.

**ƏCƏLƏ** [*ər.*] 1. *is.* Tələsmə, bir işi tez-tələsik görməyə çalışma, səbirsizlik göstərmə. ☐ **Əcələ etmək** – tələsmək. *Arıq atlı konka stansiyaya yaxınlaşmışdı, o minmək üçün əcələ edərkən ağır bir qol çiynindən yapışdı.* A.Şaiq. [Səfərəli:] *Rica edirəm, əcələ ediniz.* H.Nəzərli.

2. *zərf* və *sif.* Tələsik, cəld, tez-tələsik. *..Bir paramız əcələ bir dəstə sazlayıb qışqırırıq.* C.Məmmədquluzadə. [Roza:] *Neçin? Əcələ bir işinizmi var?* H.Cavid. ☐ **Əcələ ilə** – tələsik, sürətlə, tez, cəld. [Gülçöhrə:] *Görürsən, mənim başıma nə işlər gətirirlər?.. Mümkün var isə, gəl tez qaçaq* (*əcələ ilə dartınır*). Ü.Hacıbəyov. *Xidmətçilər əcələ ilə o tərəf-bu tərəfə hərəkət edirdilər.* M.İbrahimov.

**ƏCƏLƏLİ** *sif.* Tələsik, təcili, təxirəsalınmaz. [Xortdan:] *Yox, bir belə müddət gözləməyi mən bacarmayacağam. İşim əcələlidir.* Ə.Haqverdiyev.

**ƏCƏLMAYALLAQ** b a x **əcəlmüəlləq**.

**ƏCƏLMÜƏLLƏQ** *is.* [*ər.*] *dan.* Gözlənilməyən, təbii olmayan ölüm.

**ƏCƏLSİZ** *zərf* Əcəli çatmadan, vaxtsız, vaxtı çatmadan. [Rəsul:] *Budur, bu gün dörd cavan əcəlsiz dünyadan getdi.* Ə.Haqverdiyev. *Əcəlsiz öldürür məni firqətin; Əyibdir qəddimi dərdin, möhnətin.* Aşıq Şəmşir.

**ƏCƏM** *is.* [*ər.*] 1. *köhn.* Keçmişdə ərəb olmayan xalqlara və onların nümayəndələrinə, xüsusən, iranlılara, İran əhalisindən olan adamlara verilən ad. *Məndən salam olsun əcəm oğluna; Meydana girəndə meydan mənimdir.* "Koroğlu".

2. *tar.* İran. *Leyli-Məcnun Əcəmdə çoxdur; Ətrakdə ol fəsanə yoxdur.* Füzuli.

**ƏCƏMİ** *sif.* [*ər.*] *köhn.* 1. Qeyri-ərəb qövm və tayfalardan birinə mənsub olan, ərəb olmayan.

2. İranlı, fars.

3. *məc.* Yad, özgə, yabançı.

**ƏCƏR** *is.* Təzəlik, işlənməmiş olma. *Vurtut ikicə ilin gəlini olan, gəlinlik paltarının əcəri solmayan Keysubəyimin nisgili ürəyində, arzusu gözündə qalmışdı.* Ə.Vəliyev.

**ƏCƏRİ** *sif.* Təzə, qədtəzə, heç geyilməmiş, işlənməmiş. *Əcəri don. Əcəri yorğanüzü. – Zeynəbin bu saat dörd-beş dəst əcəri paltarı boxçadadı.* C.Məmmədquluzadə.

**ƏCƏRLİ** bax **əcəri**. *Əcərli paltar. Əcərli xalça. – Mən də o mülahizədəyəm, Zəriş! – deyə Müqim bəy birdən pristavlıq paltarının ən əcərlisini geyməyə, tərləyə-tərləyə ora-burasını dartışdırmağa başladı.* S.Rəhimov. [Əmir:] *Bu əcərli gəbələr pristav ağanın halal xoşu olsun, öz anasının südü kimi.* Ə.Abasov.

**ƏCİB(Ə)** [*ər.*] bax **əcaib**.

**ƏCİNNƏ** *is.* [*ər.*] *din. köhn.* Cin. *Əcinnə padşahı* (*nağıllarda*). – *Əhmədi-Çekkaş durub gəldi evə. Çağırıb əcinnələri, əmr elədi.* (Nağıl). [Nəcəf:] *Nə sirr olacaq? Tovuz dərəsi əcinnə yeridir*: *şəyatin yığnağına rast gəlibsiniz.* M.F.Axundzadə. [2-ci əcinnə:] *Hə, indi başa düşdüm, doğrudan da, deyəsən, sən çox ağıllı əcinnəsən.* Ə.Haqverdiyev.

**ƏCLAF** *sif.* [*ər.*] Alçaq, rəzil. [Bəhram:] *O vaxt bizim nahiyənin pristavı Navedski adında çox rəhmsiz və əclaf bir adam idi.* Ə.Vəliyev. // İs. mənasında. *Ağa, Təbrizdə 5-10 nəfər əclaf ilə bacarmaq olmur.* M.S.Ordubadi.

**ƏCLAFLIQ** *is.* Alçaqlıq, rəzillik, rəzalət. *Əclaflıq etmək.* [Piri düşünürdü ki, Xalıq deyəcək:] *"Kişi kişinin namusuna toxunmaz, Piri. Mən bu sirri ürəyimdə qəbrə aparacağam. Amma boynuna al ki, əclaflıq eləmisən".* İ.Məlikzadə.

**ƏCNƏBİ** [*ər.*] 1. *sif.* Başqa xalqa, millətə mənsub olan; xarici. *Əcnəbi mallar. Əcnəbi dillər. Əcnəbi ölkələr. – Həmədan yenə də əcnəbi casuslarının yuvasına çevrilmişdi.* M.S.Ordubadi.

2. *is.* Başqa ölkənin vətəndaşı, təbəəsi; xarici. *Əcnəbilərə məxsus mehmanxana. – Hacı Mirzə Həsən ağa müctəhidin gözünün qabağında minlərcə müsəlman övrət-uşaqları .. əcnəbilərin evində gizləniblər.* C.Məmmədquluzadə. *Əcnəbi yenə çamadanı* [Məşədi Əsgərə] *verməyib, təcilən .. vağzaldan şəhərə çıxdı.* S.M.Qənizadə.

**ƏCR** *is.* [*ər.*] *köhn.* Bir iş müqabilində verilən əvəz; qarşılıq. *Öz adətin ilə nalə eylə; Əcrini mənə həvalə eylə.* Füzuli. [Səlim bəy:] *Bu qədər xalqın duası sizin əcrinizdir.* M.F.Axundzadə. *Güman etməyin ki, Şeyx Şaban əzan verməyinə muzd alırdı. Xeyr, əstəğfürullah, əzan verməyi məhz savab əməl hesab edərdi və əcrini qiyamətdə Allahdan gözləyirdi.* Ə.Haqverdiyev. // Cəza mənasında. *İndi əcrindir, könül, çək şami-hicrin dərdini; Mən əzəl gün söylədim pəndi-firavanlar sənə.* S.Ə.Şirvani. *Zülm edən kimsələrin əcri budur.* M.Rahim. □ **Əcrini çəkmək** – cəzasını çəkmək. [Vaqif:] *Məmməd cəzasına çatmışdır, – dedi, – xanın üzünə ağ olan əcrini çəkməlidir..* Çəmənzəminli. [Zülfüqar:] *Qoy əl-ayağı dinc durmayanlar əcrini çəksinlər.* B.Bayramov.

**ƏCUZƏ** *is.* [*ər.*] Pisxasiyyətli və bədləkər arvad.

**ƏCZ** *is.* [*ər.*] *klas.* Acizlik, iqtidarsızlıq. *Əcz ilə dedi ki*: *"Ey xudavənd; Şahənşahi-adilü xirədmənd!"* Füzuli. [İblis Arifə:] *..Əzizim, çocuq olma! Arif! Mana bax, əczi burax, hissə qapılma.* H.Cavid. *..Sitarə Mənsurun əlini əcz ilə tutub dizi üstə oturub*: *– Aman Mənsur! Məni hicr oduna yandırma.* C.Cabbarlı.

**ƏCZA** *is.* [*ər.* "cüz" söz. cəmi] 1. *klas.* Bir şeyin tərkibini təşkil edən xırda hissəciklər; cüzlər. *Yandırıb əczayi-tərkibim, külüm versən yelə; Yox yolundan dönməyim,*

*varım sənindir, cüzvü kül.* Füzuli. [Molla İbrahimxəlil:] *Daha bundan artıq nə eyləyəcəksiniz ki, bu gün iksir tamam və təkmil olan saatda və əcza butədə qaynayan vaxtda bu yerə ayaq basdınız.* M.F.Axundzadə. *Su nədir? Nə əczadan əmələ gəlir, nə səbəbə su qaynayanda buğ olur, niyə donanda bərkiyir?* C.Məmmədquluzadə.

2. Dərman maddələri; dərman, dava. *Bu əcza qulluqçu naxoş olanda alınmışdı.* C.Cabbarlı.

**ƏCZAÇI** *is.* Aptekdə dərman hazırlayan mütəxəssis; farmasevt. *Fakültə xüsusi şöbələrdə diş həkimləri və əczaçılar da hazırlayır.* M.Topçubaşov. *Əczaçı, məlumdur ki, dəva satır; Xanəndə oxuyur, xoş səda satır; Nəfəs almaq üçün bağa gedəndə; Biri də biletlə boş hava satır.* Şəhriyar.

**ƏCZAÇILIQ** *is.* Dərman hazırlamaq, hazırlanan dərmanları yoxlamaq, saxlamaq və buraxmaq haqqındakı tətbiqi fənlərin məcmusu; dava-dərman hazırlama sənəti. *Əczaçılıq texnikumu. Əczaçılıq məhsulları.*

**ƏCZAXANA** [*ər.* əcza və *fars.* ...xanə] *köhn.* Əczaçı dükanı, dərman satılan yer, aptek. *Kiçik oğlu mühəndis böyük qardaşının əmrlərinə itaət edirdi: əczaxanaya getmək, həkim yanına yüyürmək, kətan islatmaq və sairə.* Ə.Haqverdiyev. *Baytarlıq müalicə məntəqəsinin apteki müvafiq avadanlıq tələb edən əczaxana olub, xüsusi otaqda yerləşdirilməlidir.* R.Əliyev.

**ƏDA**[1] *is.* [*ər.*] 1. Tərz, tövr, üslub. *Bu nə ədadır?* – [Hacı Əhməd:] [Almaza] *Sən ki bu yol ilə, bu əda ilə bizə yaxın gəldin, biz kəndlilərin bütün malımız, canımız, hər bir şeyimiz sənə qurbandır.* C.Cabbarlı. *Usta bunu elə bir əda ilə dedi ki, Azad ona baxıb düşündü.* S.Rəhman. *Eldarın xoş bir əda ilə: – Buyurun, buyurun! – dediyini eşitdim.* M.Rzaquluzadə. // Özünü aparma tərzi, hərəkət tərzi; adət, xasiyyət. *Bu nə ədadır? Pis əda. Yoldaşının ədalarını öyrənib.*

2. Naz, qəmzə, şivə, şıltaq. *Qadan alım, ey qaragöz, sənə bu əda neçindir? Nə üzü qaralıq etdim, mənə bu cəfa neçindir?* S.Ə.Şirvani. [Knyaz:] *İçəlim, badə verir ruhə qida; Varsın, olsun məzəmiz işvə, əda!* H.Cavid. *İndi ədaların yadına düşüb; Yandırırmı səni, yaxırmı səni?* R.Rza.

3. İddia, təşəxxüs. *Bunun ədasına bax!*

4. İş, əməl. *Ədası başqa, sözü başqa.*

**ƏDA**[2] [*ər.*]: **əda etmək** – 1) vermək, ödəmək, ödəyib qurtarmaq. [Nəcəf bəy:] *Əgər vədə tamamında borcumu əda etməsəm, girovdan məyusam.* Ə.Haqverdiyev; 2) yerinə yetirmək. [Ağa Salman:] *Gedim, sərbazları görüm, əhvalatı xəbər alım ki, mürafiə vaxtında şəhadətlərini əda etsinlər.* M.F.Axundzadə. *Amma mətəəssüf öz borclarımızı nəinki layiqincə əda etmirik, hətta .. sağmal inəyimizin boğazına bıçaq sürtənlərə kənardan arxayın tamaşa edirik.* F.Köçərli. *..Öhdəmizə götürdüyümüz .. vəzifəni əda etməkdə bacarığımızı və səyimizi əsirgəməyəcəyiz.* C.Məmmədquluzadə; 3) icra etmək, ifa etmək, qılmaq. *Şah .. şam və xüftən namazını əda etdi.* M.F.Axundzadə. *Ramazanın yovmiyyə namazını orada əda edirdim.* C.Məmmədquluzadə.

**ƏDABAZ** *is.* [*ər.* əda və *fars.* ...baz] Ədabazlıq edən, ədabazlıq etməyi sevən adam. *Ədabazın birisi, bəs niyə belə qaçırsan? Dur görək, nə var, nə yox.* M.S.Ordubadi. // Sif. mənasında. *Ədabaz adam. Ədabaz qız.*

**ƏDABAZCASINA** *sif.* və *zərf* Ədabaz kimi, ədabaza xas olan bir tərzdə. *Ədabazcasına gülüş. Ədabazcasına hərəkət. Ədabazcasına yerimək.*

**ƏDABAZLIQ** *is.* Ədalı hərəkətlər, sadəlikdən, təbiilikdən məhrum hərəkətlər; özünü qeyri-təbii, qeyri-sadə aparma. *Ədabazlıq etmək. – Cabbarın şit hərəkətlərlə, ədabazlıqla işi olmazdı.* İ.Əfəndiyev. *Ancaq bunların heç biri ədabazlığından, yaxud özündən müştəbeh olmağından irəli gəlmirdi.* B.Bayramov. // Əzilib-büzülmə, özünü əzmə, özünü naza qoyma.

**ƏDALƏT** *is.* [*ər.*] 1. Haqq və düzgünlük prinsiplərinə riayət. *Ədalətə riayət etmək. İctimai ədalət. Ədalət hissini itirmək. Ədaləti bərpa etmək.* – [Pişxidmət:] *Haqq və ədalətmi? ..O bir quş olsa, şahın sarayında yapamaz yuva.* H.Cavid. *Aldadır bəşəri yalan vədələr; Haqdan, ədalətdən yoxdur bir əsər.* S.Vurğun. ☐ **Ədalət divanı** *köhn.* – b a x **ədalət məhkəməsi**. *Paşa o saat bir*

*әdalәt divanı qurub keşişi dә çağırtdırdı.* "Әsli vә Kәrәm". [Muzdur] *әlindәki dövlәti, hәr necә olsa, әdalәt divanına yetirmәyә niyyәt qoydu.* S.M.Qәnizadә. **Әdalәt mәhkәmәsi** – әdalәtlә işә baxan, әdalәtli hökm çıxaran mәhkәmә. *Bu gün, sabah qurulacaq; Bir әdalәt mәhkәmәsi.* S.Vurğun.

2. İnsaf, mürüvvәt. *Әdalәtlә* (z.) *hәrәkәt etmәk. Әdalәtlә* (z.) *işә baxmaq. – Adil, hәyatda şeir vә hikmәt aşiqi, insaf vә әdalәt tәrәfdarı idi.* S.Rәhimov. ☐ **Әdalәt etmәk** – insaf etmәk, insafla hәrәkәt etmәk. *Sair milәl övrәtlә әdalәt edir etsin! Övrәt әrә, әr övrәtә rәğbәt edir etsin!* M.Ә.Sabir.

**ӘDALӘTXANA** *is.* [*әr.* әdalәt vә *fars.* ...xanә] *köhn.* Әdalәtlә işә baxan mәhkәmә, divanxana.

**ӘDALӘTLİ** *sif.* Әdalәtlә, vicdanla hәrәkәt edәn, hәqiqәtә, insafa, vicdana uyğun olaraq hәrәkәt edәn. *Әdalәtli hakim. Әdalәtli müdir.* // Әdalәtә, hәqiqәtә, insafa әsaslanan. *Әdalәtli mәhkәmә. Әdalәtli hәrәkәt. Әdalәtli qanunlar.*

◊ **Әdalәtli müharibәlәr** – istiqlaliyyәt uğrunda aparılan müharibәlәr, inqilabi azadlıq müharibәlәri.

**ӘDALӘTLİLİK** *is.* Әdalәtli olma, işә qәrәzsiz, vicdanla, әdalәtlә yanaşma; әdalәt. *Mәhkәmәnin әsas xüsusiyyәti әdalәtlilikdәdir.*

**ӘDALӘTPӘRVӘR** *sif.* [*әr.* әdalәt vә *fars.* ...pәrvәr] Әdalәt sevәn, әdalәtә riayәt edәn, әdalәtli. *Әdalәtpәrvәr adam.*

**ӘDALӘTPӘRVӘRLİK** *is.* Әdalәtpәrvәr adamın keyfiyyәti. *Әdalәtpәrvәrlik göstәrmәk. Әdalәtpәrvәrlik yaxşı sifәtdir.*

**ӘDALӘTSİZ** *sif.* Әdalәtә, haqq vә insafa riayәt etmәyәn, әdalәt hissini itirmiş, insafsız. *Әdalәtsiz hökmdar. – Küçәyә atdın әdalәtsiz ata, qansız ata! Mәni tәhrik elәmә alverә, vicdansız ata!* Ә.Vahid. // Әdalәtә, haqq vә insafa müğayir olan. *Әdalәtsiz hökm. Әdalәtsiz hәrәkәt. – Lakin zavallı bacısının xәrcinә gәldikdә, Mahmud onun heç üzünә gülmәdәn taleyi tәrәfindәn tәyin olunmuş, әdalәtsiz bir vergi hesab edirdi.* B.Talıblı.

**ӘDALӘTSİZLİK** *is.* Әdalәtә, haqq vә insafa müğayir hәrәkәt. *Burjua mәhkәmәsinin әdalәtsizliyi. – Bu hürriyyәt әsrindә* [XX әsrdә] *belә әdalәtsizliyә* [zülmә vә tәcavüzә] *baxdıqda ürәyimiz qan ilә dolur..* F.Köçәrli. *Zәnnimcә, xilqәtdәn әvvәl әdalәtsizlik vә vicdansızlıq yaranmışdır.* C.Cabbarlı.

**ӘDALI** *sif.* 1. Әdası olan, әdabaz. *Әdalı adam.* // Әda ilә dolu, sadәlikdәn, adilikdәn mәhrum. *Әdalı hәrәkәt.* // Mütәkәbbir. *Sarayda hökm edir әdalı bir xan; Qan, qarğış tökülür qaşqabağından.* S.Vurğun.

2. İşvәli, işvәkar, nazlı. *Әdalı qız. Әdalı baxış. Әdalı yeriş. – Mәrhәmәtsiz mәlәk, әdalı gözәl; Gör nә yandı bir vüsalә bәdәl?!* H.Cavid.

**ӘDALILIQ** *is.* Әdalı olma.

**ӘDASIZ** *sif.* 1. Heç bir әdası olmayan, özünü sadә aparan. *Әdasız adam.*

2. Nazsız, işvәsiz, sadә. *Әdasız qız. – Yoxsa dilbәrim deyilmiş әdasız; Pәk nazlıdır, amma deyil vәfasız.* H.Cavid.

**ӘDASIZLIQ** *is.* Әdasız adamın xassәsi; sadәlik.

**ӘDAT** *is.* [*әr.*] 1. *qram.* Müstәqil mәnası olmayan, lakin cümlәdә müxtәlif mәna çalarları әmәlә gәtirәn söz, hissәcik.

2. *köhn.* Alәt, avadanlıq, lәvazimat.

**ӘDAVӘT** *is.* [*әr.*] Ürәkdә saxlanılan düşmәnçilik hissi, kin, küdurәt, qәrәz, birinә qarşı qәzәb hissi. *..Bәy bir mәclisdә danışdı ki, Mirzә Möhsünlә mәnim bir әdavәtim yoxdur.* Qantәmir. ☐ **Әdavәt bәslәmәk** – kin bәslәmәk, kin-küdurәt bәslәmәk, birisinә qarşı düşmәncәsinә hiss bәslәmәk. [İblis:] *Hәr kәs mәni dinlәr, fәqәt eylәr yenә nifrәt; Hәr kәs mәnә qul ikәn, bәslәr әdavәt.* H.Cavid. *Naşad әfәndi Mehribana qarşı indi bir kin vә әdavәt bәslәyirdi.* S.Hüseyn. // Ümumiyyәtlә, düşmәnçilik, düşmәnlik. *Çәrxi-sitәmgәrin, hәrzә talein; Ölüb qurtarmadıq әdavәtindәn.* Q.Zakir. [Cavad bәy:] *Xan, cәnabinizә mәlum olan әdavәtә görә Sәmәd xanın oğlu Sәfiqulu xan böyük cәfakarlıq edir.* N.Vәzirov. ☐ **Әdavәt aparmaq** – düşmәnçilik etmәk, düşmәncәsinә münasibәt bәslәmәk. *Xanpәriyә elә gәlirdi ki, kim isә onunla әdavәt aparır.* Ә.Vәliyev. **Әdavәt doğurmaq** – әdavәtә, düşmәnçiliyә sәbәb olmaq. [İblis:] *Get, lakin o hörmәt vә mәhәbbәt; Bir gün doğurur qanlı әdavәt.* H.Cavid. **Әdavәt etmәk** – düşmәncәsinә münasibәt bәslәmәk, düşmәnçilik

etmək, ədavət bəsləmək. *Asudə nəfəs çəkməyə halət edə fəhlə; Yainki hüquq üstə ədavət edə fəhlə.* M.Ə.Sabir. **Ədavət qalxmaq (doğmaq, düşmək)** – araya düşmənçilik düşmək, bir-biri ilə düşmən olmaq. [Məhərrəm:] *Nə üçün yaxın bir qohumun arasında ədavət qalxsın?* C.Cabbarlı. [Tələbə:] *Bir də, heç mən intriqa bilən adam deyiləm. Görürəm dərnək işlərinə qoşulsam, yoldaşlarımızla aramızda ədavət düşəcək.* Qantəmir. **Ədavət salmaq** – araya düşmənçilik salmaq, biri-biri ilə salışdırmaq, vuruşdurmaq. *Bir söyləyən yox, ay başıbatmış, nə borcuna; Haqqı nədir, salırsan ədavət, gavur qızı?!* M.Ə.Sabir. *Özü də istəyirdi ki, yerli xalqla bizim aramıza ədavət salıb öz hakimiyyətini bərkitsin.* M.Rzaquluzadə.

**ƏDAVƏTLİ** *sif.* Ədavəti olan, ürəyində ədavət bəsləyən, kin bəsləyən, düşmənçilik edən, düşməncəsinə münasibət bəsləyən; düşmən. *Görün heç biz ədavətli .. adamlara bənzəyirikmi?* M.İbrahimov.

**ƏDAVƏTLİLİK** *is.* Düşmənçilik, kinlilik.

**ƏDAVƏTSİZ** *sif.* Heç bir kini, ədavəti olmayan; kinsiz.

**ƏDD** [*ər.*]: **ədd etmək** *köhn.* – saymaq, hesab etmək. *Hər yetən kəndin mühərrir ədd edib min söz yazır.* M.Ə.Sabir. [Rza bəy:] *..Bu mübhəm sükutunuzu kəndim üçün böyük bir həqarət ədd edəcəyəm.* Ü.Hacıbəyov. *Hətta Fərhad oxumuş olduğu üçün* [Aslan] *onu özündən daha mərhəmətli, insaniyyətpərvər və safdil ədd edirdi.* C.Cabbarlı.

**ƏDƏ** b a x **adə**. *Ədə, Eyvaz, bəri gəl, müştəri gəlib.* "Koroğlu". *Ədə, Həsənəli, naxır gəlir, qaç, tövlənin qapısını aç.* C.Məmmədquluzadə. [Əsgər:] *Dedim, yəqin ki mənimlə düşməndir, o saat piştovu belimdən çıxartdım, çəkdim yuxarı ayağa, dedim*: *Ədə, dayan!* Ü.Hacıbəyov. [Kərbəlayı:] *Ədə, qoysana kişi sözün danışsın.* H.Nəzərli.

**ƏDƏB** *is.* [*ər.*] Əxlaq qaydalarına riayət, əxlaq və hərəkətdə, danışıqda nəzakət, incəlik; tərbiyə. *Ədəb qaydaları. – Ədəbi kimdən öyrəndin? – Biədəbdən.* (Ata. sözü). *Ədəbdən, elmdən gər feyzyab olsa əvamünnas; Düşər tənü şərəfdən mollalar, işanlar, insanlar.* M.Ə.Sabir. *Baxdıqca onun marağı artır; Elmə, ədəbə, kitaba hərdəm.* A.Səhhət. [Müəllim:] *Özümdən ədəb və nəzakət xaricində heç bir hərəkət baş verməmişdi.* S.Hüseyn. // Utancaqlıq, həya. *Üzündən ədəb yağır.* // Hörmət, ehtiram, sayğı. [Məhbub xanım] *ədəb salamını yerinə yetirib dayandı.* (Nağıl). *Təzə gəlinlər, cavan qızlar* [Sara xanımın] *yanına girə bilməzdi*: *ədəb, həya, hörmət vardı.* Qantəmir. **Ədəblə** şəklində *zərf* – hörmətlə, ehtiramla. *Ədəblə danışmaq. Ədəblə cavab vermək. – Tülkü görcək yavaş-yavaş gəldi; Endirib baş, ədəblə çömbəldi.* M.Ə.Sabir. *Uşaq cürətlənib hərəkətə gəldi, irəli yeridi, əllərini yanına salıb ədəblə salam verdi.* Mir Cəlal. *Qoçaq əsla tələsmədən əti götürdü və bir-iki addım kənara çəkilib ədəblə gəmirməyə başladı.* M.Rzaquluzadə. □ **Ədəb gözləmək** – əxlaq, tərbiyə, nəzakət, hörmət qaydalarına riayət etmək; öz hərəkət və sözlərində tərbiyəli, nəzakətli olmaq. *Lağv olma, ədəb gözlə bu məvadə, əkinçi! Lal ol, a balam, başlama fəryadə, əkinçi!* M.Ə.Sabir. *Talıb xan .. ədəb gözləyən yasovulun açılışmağının səbəbini yaxşıca anlamağa başlayırdı.* S.Rəhimov.

**ƏDƏB-ƏRKAN** *is.* [*ər.*] Ədəb, tərbiyə, əxlaq, nəzakət qaydaları. *Ədəb-ərkan gözləmək. – Ədəb-ərkan nədir, yaxşı anlasın; Mənəm deyib, çox havadan getməsin.* Aşıq Rəcəb. [Həsən:] *Hər adamın yerini bilirsən, ədəb-ərkanla* (z.) *da danışırsan.* Ə.Haqverdiyev.

**ƏDƏB-ƏRKANLI** *sif.* Ədəbli, tərbiyəli, nəzakətli. *Gərək bir azca həlim, ədəb-ərkanlı olsun; Bir az arlı, namuslu, bir az vicdanlı olsun.* X.Rza.

**ƏDƏBİ** *sif.* [*ər.*] Ədəbiyyata aid olan. *Ədəbi əsər. Ədəbi cərəyan. Ədəbi irs. Ədəbi müşavirə. Ədəbi müsabiqə. – Əlbəttə, ədəbi ənənənin mütərəqqi məziyyətlərini yaşatmaq gərəkdir və zəruridir.* S.Rəhimov. *Ədəbi əsər bədii təfəkkürlə bağlıdır.* M.İbrahimov. □ **Ədəbi işçi** – qəzet və ya jurnallarda çap edilən materialların dili və üslubu üzərində işləyib onu çapa hazırlayan işçi. [C.Cabbarlı] *sonra .. ədəbi işçi və mütərcim vəzifəsində çalışmağa başladı.* M.Arif. **Ədəbi oğurluq** – özgənin əsərini öz adı ilə vermə, yaxud adını göstərmədən

özgənin əsərindən istifadə etmə. // Ədəbiyyatla bağlı, əlaqədar. *Yazıçının ədəbi fəaliyyəti. Ədəbi dairələr. – Yeni yetişən ədəbi gənclik həmişə Cabbarlının diqqət mərkəzində idi.* M.Arif.

◊ **Ədəbi dil** – ümumxalq dilinin qrammatika, leksika, tələffüz və s. cəhətdən müəyyən normalara malik olan işlənmiş forması. *Ədəbi dil normaları. – Səmədin o dövrdəki ədəbi dili təşbehlər, idiomlarla dolu canlı xalq dilidir.* O.Sarıvəlli.

**ƏDƏBİLƏŞDİRİLMƏ** "Ədəbiləşdirilmək"dən *f.is.*

**ƏDƏBİLƏŞDİRİLMƏK** *məch.* Dili və üslubu üzərində işlənilərək ədəbi şəklə salınmaq (əsər).

**ƏDƏBİLƏŞDİRMƏ** "Ədəbiləşdirmək"-dən *f.is.*

**ƏDƏBİLƏŞDİRMƏK** *f.* Əsərin dili və üslubu üzərində işləyərək onu ədəbi şəklə salmaq.

**ƏDƏBİSTAN** *is.* [*ər.* ədəb. və *fars.* ...stan] *köhn.* Əsil mənası "ədəb, tərbiyə yeri, ədəb öyrədilən yer" olub, köhnə ədəbiyyatda "məktəb" mənasında işlənmişdir. *"Ülfət" kəsilib, toxtadı "Bürhani-tərəqqi"; Məhv oldu "Həmiyyət", ədəbistan da qapandı.* M.Ə.Sabir. *Elmi-sənaye, ədəbistan nədir? Ağrın alım, tülkü nə, meydan nədir?* Ə.Nəzmi.

**ƏDƏBİYYAT** *is.* [*ər.*] 1. Hər hansı bir xalqın, dövrün və ya bütün bəşəriyyətin yaratdığı elmi, bədii, fəlsəfi və s. əsərlərin məcmusu. *Ədəbiyyat dedikdə, yalnız bədii əsərlər deyil, həmçinin geniş mənada, bütün yazılı əsərlər nəzərdə tutulur.* M.İbrahimov.

2. Bədii əsərlərin məcmusu. *Orta əsrlər Azərbaycan ədəbiyyatı. Ortaq türk ədəbiyyatı. Klassik ədəbiyyat.*

3. Müəyyən bilik sahəsinə və ya məsələyə aid çap olunmuş əsərlər. *Siyasi ədəbiyyat nəşriyyatı.*

◊ **Sandıq ədəbiyyatı** *dan. zar.* – bu və ya başqa səbəbə görə çap edilə bilməyən yazılar. **Xalq ədəbiyyatı** – folklor. *Xalq ədəbiyyatının həcmcə ən böyük nümunələri dastanlardır. Azərbaycanın xalq ədəbiyyatı çox zəngindir.*

**ƏDƏBİYYATBAZ** *is.* [*ər.* ədəbiyyat və *fars.* ...baz] Ədəbiyyatın (xüsusilə poeziyanın) mahiyyətini dərindən dərk etmədən onunla məşğul olan və ədəbiyyatdan dəm vurmağı sevən adam; şeirbaz.

**ƏDƏBİYYATBAZLIQ** *is.* Ədəbiyyatı (xüsusilə poeziyanı) dərindən dərk etmədən onunla məşğul olma, ədəbiyyatdan dəm vurmağı sevmə; şeirbazlıq.

**ƏDƏBİYYATÇI** b a x **ədəbiyyatşünas**. // *dan.* Ali məktəbin ədəbiyyat fakültəsi tələbəsi.

**ƏDƏBİYYATÇILIQ** b a x **ədəbiyyatşünaslıq**.

**ƏDƏBİYYATŞÜNAS** *is.* [*ər.* ədəbiyyat və *fars.* ...şünas] Ədəbiyyatşünaslıq elmi ilə məşğul olan alim, ədəbiyyatşünaslıq mütəxəssisi. *Ədəbiyyatşünas professor.*

**ƏDƏBİYYATŞÜNASLIQ** *is.* Ədəbiyyat tarixi və nəzəriyyəsindən, habelə ədəbi tənqiddən bəhs edən elmlərin məcmusu. *Azərbaycan ədəbiyyatşünaslığı. Ədəbiyyatşünaslıq elmi. – Azərbaycan .. ədəbiyyatşünaslığı "Molla Nəsrəddin"in ədəbi irsinə daha dərindən yanaşmalıdır.* M.İbrahimov.

**ƏDƏBLƏNDİRMƏ** "Ədəbləndirmək"-dən *f.is.*

**ƏDƏBLƏNDİRMƏK** *f.* Ədəb öyrətmək, ədəb vermək; tərbiyələndirmək.

**ƏDƏBLƏNMƏ** "Ədəblənmək"dən *f.is.*

**ƏDƏBLƏNMƏK** *f.* Ədəbli olmaq, ədəb öyrənmək, ədəb və tərbiyə qazanmaq, tərbiyələnmək. *Uşaq məktəbə gedəndən sonra ədəbləndi.*

**ƏDƏBLİ** *sif.* 1. Yaxşı tərbiyə görmüş, cəmiyyətdə özünü apara bilən, əxlaqlı, tərbiyəli. *Ədəbli uşaq. – Mələkxatın gördü İbrahim çox ədəbli və ağıllı oğlandı.* (Nağıl). *Vaqiən Qasım əmi çox ədəbli və söz eşidən idi.* C.Məmmədquluzadə.

2. Ədəb qayda-qanunlarına uyğun. *Ədəbli söz. Ədəbli hərəkət. Ədəbli* (z.) *danışmaq.*

**ƏDƏBLİCƏSİNƏ** *zərf* Ədəbli surətdə, nəzakətli surətdə, nəzakətlə. *Ədəblicəsinə cavab vermək. Ədəblicəsinə salam vermək.*

**ƏDƏBLİ-ƏRKANLI** *sif.* b a x **ədəb-ərkanlı**. *Ədəbli-ərkanlı oğlan.* – [Qızın anası:] *Bax, ədəbli-ərkanlı, saçlı-birçəkli, boylu-buxunlu, gözəl-göyçək qız bəsləmişəm.* H.Sarabski.

**ƏDƏBLİLİK** *is.* Ədəbli, tərbiyəli adamın xassəsi, ədəbli olma. *Oğlan ədəbliliyindən başını aşağı saldı və cavab vermədi.*

**ƏDƏBSİZ** *sif.* 1. Ədəb və tərbiyədən məhrum, yaxşı tərbiyə görməmiş, cəmiyyətdə özünü apara bilməyən. *Ədəbsiz adam. Ədəbsiz oğlan. – Ey üzü qarə, füzul, ədəbsiz; Heç bilmədiniz nədir ədəbsiz!* Xətayi. // Zərf mənasında. *Ədəbsiz danışmaq.* // İs. mənasında. *Arvad dəcəllərə acıqlandı*: *– Ədəbsizlər, qanacaqsızlar, .. yazıqla nə işiniz var?* Ə.Abasov.

2. Ədəb qayda-qanunlarına uyğun gəlməyən, nalayiq. *Ədəbsiz söz. Ədəbsiz hərəkət.* – [Mürtəcelər] *..bu vaxta qədər heç bir kağıza sığmayan ədəbsiz küçə söyüşlərinə qədər .. yazırdılar.* M.İbrahimov.

**ƏDƏBSİZCƏSİNƏ** *zərf* Ədəb normalarına zidd olaraq, utanmazcasına, həyasızcasına, nəzakətsizcəsinə, kobudcasına. *Ədəbsizcəsinə tələb etmək. Ədəbsizcəsinə valideynin üzünə qabarmaq. Ədəbsizcəsinə hərəkət etmək.*

**ƏDƏBSİZLİK** *is.* Ədəb və tərbiyə nöqsanı, tərbiyəsizlik, nəzakətsizlik, qanacaqsızlıq. *Ədəbsizlikdən doğan kobudluq.* // Ədəbsiz hərəkət, söz. *Ədəbsizlik etmək. – Molla başını qaldırıb Teymurun bu ədəbsizliyinə heyran-heyran baxır.* "M.N.lətif.". *Zeynalın bu ədəbsizliyinə qarşı Dursun o qədər də susmayırdı.* A.Şaiq. *Bu zamanlarda bəzi narəva hallar üz verib, bir taqım ədəbsizliklər olmuşdusa da, Mehriban onlara göz yumub qatlaşmışdı.* S.Hüseyn.

**ƏDƏD** *is.* [*ər.*] 1. Say, hesab. *Ədədlərin dörd əməlindən bəhs edən elmə hesab elmi deyilir. – Daha sonralar say prosesində insan konkret cisimlərdən uzaqlaşır, onda ədəd anlayışı əmələ gəlir.* Z.Xəlilov. // Rəqəm. *5 ədədi ilə 3 ədədi 8 ədədinə bərabərdir.*

2. Eyni cinsli şeylərdən bir dənəsi; dənə. *İki ədəd qələm. On ədəd yumurta. Beş ədəd karandaş aldım. – Var idi mənim bir ədəd gövhərim; Gülbəndi-mina və taci-zərim.* M.Ə.Sabir.

**ƏDƏDİ** *sif.* [*ər.*] *riyaz.* Ədədlərlə ifadə olunan. *Ədədi kəmiyyət. Ədəbi nisbət. – Diferensial tənlikləri təqribi həll etmək üçün müxtəlif qrafik və ədədi metodlar vardır.* Z.Xəlilov. // Ədədə, miqdar, ya rəqəmə aid olan. ◻ **Ədədi mal(lar)** – çəki və ölçü ilə deyil, ədədlə sayılan mal(lar). *Ədədi mallar satılan mağaza. Papiros ədədi maldır.*

**ƏDƏDSİZ** *sif.* Saysız-hesabsız, sayı-hesabı olmayan.

**ƏDƏLLİ-BƏDƏLLİ** *sif. dan.* Yaxşı, kamil, əməlli-başlı, ciddi. [Mədəd] *ədəlli-bədəlli oğlan, evli-eşikli kişidir.* Ə.Vəliyev.

**ƏDƏM** *is.* [*ər.*] *klas.* Yoxluq. *Yəni ki, "vücud dami-qəmdir; Azadələrin yeri ədəmdir".* Füzuli. [Xəyyam:] *O fəzalar belə müzlim pərdə; Bir ədəm dalğası var hər yerdə.* H.Cavid.

**ƏDƏMGAH** *is.* [*ər.* ədəm və *fars.* ...gah] *tənt.* Yoxluq aləmi. [Şeyx Sənan:] *O da bir karivan, axıb gediyor; Bir ədəmgaha doğru əzm ediyor.* H.Cavid.

**ƏDƏSƏ** *is.* [*ər.*] 1. Mərcimək dənəsi.

2. Gözlük, durbin, zərrəbin və s. optik cihazlarda işlənən, ortası qabarıq və kənarları nazik şüşə; linza. [Eldar:] *Bu, ədəsə ilə oxunacaq dərəcədə xırda, zərif bir xətlə cığara kağızına yazılmış bir məktub idi.* M.Rzaquluzadə.

**ƏDƏSƏLİ** *sif.* Ədəsəsi olan, linzalı. *Ədəsəli durbin.*

**ƏDƏVA, ƏDƏVİYYƏ** bax **ədviyyat**. *Şahzadə gördü ki, yaxşı toyuqplov, bütün ədəviyyəsinən, .. yüz manat da pul.* (Nağıl). *Nanə xalanın özü də qoluçırmaqlı, əlində qaşıq xörəyə ədəva tökür, hərdən mətbəxin qapısından boylanırdı.* Mir Cəlal.

**ƏDİB** *is.* [*ər.*] 1. Yazıçı, nasir. *Azərbaycan ədibləri. – Möhtərəm ədibimiz ingilislərin imlasının adını qoyur "əcib", amma bizim imlaya heç olmasa "bir az əcib" də demək istəmir.* C.Məmmədquluzadə. *Ziyafətdə şair və ədiblərin, ordu ilə gedənlərin özləri və ailələri iştirak edirdi.* M.S.Ordubadi. // Ədəbiyyatla məşğul olan adam, ədəbiyyatşünas, ədəbiyyat mütəxəssisi. // Mühərrir. *Ədib Mirzə Melkum xan "Qanun" ruznaməsində başdan belə yazır ki: "Mən sözümü o kəslərə yazıram ki, adamdırlar".* C.Məmmədquluzadə. *Gəncədə bir ədibi-biəmsal; Bir qəzet açdı, adı "İstiqbal".* Ə.Nəzmi.

2. *klas.* Ədəbli, tərbiyəli. *Məcnun dedi*: *Ey ədibi-kamil; Divaneyi-eşq olurmu aqil?*

Füzuli. *Necə kim bir ədibi-mümtazın; Dərsi-hikmət ədası tərbiyədir.* M.Ə.Sabir.

**ƏDİBANƏ** *sif.* [*ər.* ədib və *fars.* ...anə] *klas.* Ədib kimi. // Ədəbi dillə, ədəbi tərzdə. *Əlli sənə .. millətin keçəcək və istiqbalını, nicat və səadətini şairanə və ədibanə nəzmə çəkmək, əbnayi-millətin təlim və tərbiyəsinə, ruhani məişətinə qulluq eləmək, əlbəttə, böyük hünərdir.* F.Köçərli.

**ƏDİBCƏSİNƏ** *zərf* Ədib kimi, ədib tərzində. *Ədibcəsinə danışmaq.*

**ƏDİBLİK** *is.* Ədəbi yaradıcılıq. *Ədibliklə məşğul olmaq. Ədiblik etmək. – Qələmdani-məlahəti anlamaq üçün bəzən ədiblik kifayət etməz.* Qantəmir.

**ƏDL** [*ər.*] b a x **ədalət**. *Çünki olar ədlə xələl qatdılar; Mən yazığı mal kimicə satdılar!..* Ə.Nəzmi. *Cahan cahan deyil daha, zülmə aşiyanədir; Qalıbsa ədlü rəhmdən boş ad, o da fəsanədir.* C.Cabbarlı. *Öz əksini o görüncə bu sənətin aynasında; Məhəbbətə, ədlə qarşı rəğbət doğur bu dəm onda.* B.Vahabzadə.

**ƏDL-ƏDALƏT** *is.* [*ər.*] b a x **ədalət**. [Şah:] *Cəm olaq, həmlə edək, həbs eyliyək bu zalimi; Ta gərək ədl-ədalətlə ona olsun cəza.* Ü.Hacıbəyov.

**ƏDLİYYƏ** *is.* [*ər.*] *hüq.* Mühakimə işlərinə baxan dövlət orqanlarının məcmusu, məhkəmə orqanları sistemi. *Ədliyyə orqanları. – Ancaq gördüm ki, bu mənim işim deyil, buradan çıxdım, özümü verdim ədliyyə idarələrinə.* C.Məmmədquluzadə. *Canım, iki yüz min Təbriz camaatı ədliyyə əzası seçir.* Ə.Qəmküsar. *Mirzə Səfərin iki oğlu ədliyyə məktəbinin beşinci sinfində oxuyurdular.* Ə.Haqverdiyev. [Hacı Əli:] *Ədliyyə, nəzmiyyə idarələrini daha tez təşkil etmək lazımdır.* P.Makulu. // Ədalət, ədalət məhkəməsi. *Azərbaycan ədliyyəsi.* // Hüquq.

**ƏDNA** *sif.* və *is.* [*ər.*] *klas.* 1. Alçaq, rəzil, nanəcib. *Şah Abbas cabbarlığının ədna əlaməti bu idi ki, bir oğlunu öldürdü, ikisinin dəxi gözünü çıxartdı.* M.F.Axundzadə. *Belə iş yaramaz hərgiz əqilə; Qulaq asma hər ədnaya, sevgilim!* Aşıq Pəri. *Biz vətən mülkün həqiqətlə sevən aşiqlərik; Xaini, ədnanı yurdumdan kənar istər könül.* Ə.Vahid.

2. *köhn.* Keçmişdə aşağı təbəqədən, qara camaatdan olan adama verilən ad. *Zakir, kəs ümidi-nəzəri-mərhəmət ondan; Kim, padşahi-hüsn olan ədnayə baxarmı?* Q.Zakir. [Rizvan:] *Qibleyi-aləm! Siz padşahsınız, mən rəiyyət və ədna.* Ə.Haqverdiyev.

**ƏDNALIQ** *is.* Alçaqlıq, rəzillik, nanəciblik; alçaq hərəkət. *Gözlənməyən ədnalığın icadına ciddən; Himmət edən insanlarına şükr, xudaya!* M.Ə.Sabir. *Elmsiz ədnalığa uğratdılar; İsməti, insafı ayaqlatdılar.* Ə.Nəzmi. ☐ **Ədnalıq etmək** – alçaqlıq etmək, nanəciblik etmək.

**ƏDU** *is. klas.* Düşmən. *Ey eşqə ədu və hüsnə münkər; Təzvirlə çəkmə bunca ahı.* Nəsimi. *Əgər bütün bəşəriyyət əduvvi-canım ola; Ürək süqut eləməz aldığı mətanətdən.* C.Cabbarlı.

**ƏDVƏ** [*ər.*] b a x **ədviyyat.** *Xörəyə ədvə tökmək.*

**ƏDVƏCAT** b a x **ədviyyat.**

**ƏDVİYYAT** *top.* [*ər.*] Xüsusi dad, xoş iy, bəzən də rəng vermək üçün xörəyə və şirniyyata qatılan, ya vurulan darçın, hil, sarıkök, mixək və s. kimi maddələrin ümumi adı. *Ədviyyat qatılmış halva. Xörəyin tündlüyü ona qatılan ədviyyatdan asılıdır.*

**ƏDVİYYATLI** *sif.* Ədviyyat qatılmış. *Ədviyyatlı şirni.*

**ƏDVİYYƏ** b a x **ədviyyat**. *Ədviyyə vurulmuş xörək. – Sağ gündə dolar taxta-tabaq ədviyyə ilə; Onda ki, nənəm sancılanar, zəncəfil olmaz.* Şəhriyar.

**ƏDVİYYƏLƏMƏ** "Ədviyyələmək"dən *f.is.*

**ƏDVİYYƏLƏMƏK** *f.* Xörəyə ədviyyə vurmaq (qatmaq). *Xörəyi ədviyyələmək.*

**ƏDVİYYƏLƏNMƏ** "Ədviyyələnmək"dən *f.is.*

**ƏDVİYYƏLƏNMƏK** *məch.* Ədviyyə vurulmaq (qatılmaq, tökülmək, səpilmək).

**ƏDVİYYƏLİ** *sif.* Ədviyyə səpilmiş, ədviyyə vurulmuş. *Ədviyyəli plov. Ədviyyəli bozbaş. Ədviyyəli qoğal.*

**ƏDYAL** *is.* [*rus.*] Yataq ləvazimatı, yüngül yorğan. *Çoxu yatar, mürgülər, bürünüb ədyalına; Anam yatar, bürünüb yun saçaqlı şalına.* X.Rza.

**ƏDYAN** *is.* [*ər.* "din" söz. cəmi] *klas.* Dinlər. [İblis:] *Min hiylə quran tülkü siyasilər, o hər an; Məzhəb çıxaran, yol ayıran*

*xadimi-ədyan; Onlar əvət, onlar sizi çeynətməyə kafi..* H.Cavid.

**ƏFƏL** *sif. dan.* Əldən düşmüş, iş görə bilməyən, əlindən iş gəlməyən, ətalətli; maymaq. *Əfəl adam.* – [Koxa:] *Bax, bu zatıqırıq, yaramaz, əfəl; Demək, əl qaldırıb sizə, divana?* S.Rüstəm. [Nəcəfalı:] *Hə, bala, elə bir kişinin mənim kimi əfəl nəticəsi var.* B.Bayramov.

**ƏFƏLLƏMƏ** *dan.* "Əfəlləmək"dən *f.is.*

**ƏFƏLLƏMƏK** *f. dan.* Əfəl olmaq, əldən düşmək.

**ƏFƏLLƏŞDİRMƏ** *dan.* "Əfəlləşdirmək"-dən *f.is.*

**ƏFƏLLƏŞDİRMƏK** *f. dan.* Əfəl hala salmaq, əldən salmaq.

**ƏFƏLLƏŞMƏ** *dan.* "Əfəlləşmək"dən *f.is.*

**ƏFƏLLƏŞMƏK** *f. dan.* Getdikcə, yaxud tamamilə əfəl olmaq, əldən düşmək.

**ƏFƏLLİK** *is. dan.* Əlindən iş gəlməmə, atillik, düşkünlük. *Əyri adamın bacarıqlı olmağı, düz adamın əfəlliyindən cəmiyyət üçün daha qorxuludur.* M.İbrahimov.

**ƏFƏNDİ** *is.* [*ər.* əsli *yun.*] 1. Sünni ruhanilərinə verilən ləqəb. *Oğlan evi əfəndidən, molladan və s. qohum-əqrəbadan bir dəstə camaat dəvət edib, qız evinə nikaha gedəcəkdir.* R.Əfəndiyev. *Dəng eyləmə məni, artıq qalmamış; Ehtiyacım cənnətə, əfəndi!* Ə.Cavad. *Əlac yoxdur əfəndidən, molladan; Həqiqətin binasını axtarın.* Molla Cümə.

2. Keçmişdə: hörmət üçün oxumuş adamların, ruhanilərin adlarına qoşulan söz. // Keçmişdə: hörmətlə müraciət. *Nağıl demirəm, əfəndim, hekayə deyirəm.* N.Nərimanov. [Rza bəy:] *Əfəndilər, bir də cavab verməyəcək olsanız, bu mübhəm sükutunuzu kəndim üçün böyük bir həqarətədd edəcəyəm.* Ü.Hacıbəyov. // Türk ziyalısına müraciət. *İlk dəfə gördüyü əfəndinin .. danışıq ədası, yerişi, baxışı çox qəribə, qeyri-təbii və gülməli göründü.* M.Hüseyn.

**ƏFƏNDİLİK** *is. köhn.* Əfəndi ünvanı, əfəndi adı.

**ƏFĞAN** *is.* [*fars.*] *klas.* Fəryad, fəğan. *Oyadır xəlqi əfğanım; Qara bəxtim oyanmazmı?* Füzuli. *Hər qədər, kim artıq əfğan eylərəm, əfğan gəlir.* Qövsi. *Firqətdə lazımdır aşiqə əfğan; Sakit olmaq gərək yarı görəndə.* Q.Zakir. *Bir an səni görməyəndə, yarım; Əfğani yetirrəm asimanə.* Heyran xanım. *Bilmirəm bunca nədir ah ilə əfğanın sənin.* Ə.Nəzmi. ☐ **Əfğan etmək (eyləmək, qılmaq, çəkmək)** *klas.* – fəğan etmək, fəryad etmək. *Bir neçə gün ol əsiri-hicran; Məktəbə gəlib qılırdı əfğan.* Füzuli. *Mən Molla Vaqifəm, eylərəm əfğan; Gözlərim də yaş yerinə tökər qan.* M.P.Vaqif. *Zakirəm, çəkirəm əfğan; Bülbül kimi şəbi-hicran.* Q.Zakir. **Əfğanə gəlmək** – b a x **əfğan etmək**. *Gül camalın görüb düşsün torpağa; Bülbülü götürüb əfğanə gəlsin!* Q.Zakir. *Bağ ara bülbüli-şeyda genə əfğanə gəlib.* S.Ə.Şirvani.

**ƏFİ** *is.* [*ər.*] 1. Rəngi sarı, başı üçbucaq şəklində iri zəhərli ilan. [Rizvan] *qapının birindən daxil olan əfi ilanlara düçar olur.* Ə.Haqverdiyev. *Axırda çalar canını, bir əfi ilandır; Əfisə çalandır.* M.Ə.Sabir.

2. *məc.* Mənhus, xain, məkrli. *Əfi bir ilan kimi şübhə girir araya!* N.Rəfibəyli. // Bədxasiyyət, qəlbiqara, diliacı, başqasını sancan adam haqqında. ☐ **Əfi ilana dönmək, əfi ilan kimi fısıldamaq** – son dərəcə qəzəblənmək, qeyzlənmək. *Onlar öz acı həyat təcrübələrindən bilirdilər ki, səfər üstündə Zərrintac xanım necə bir əfi ilana dönür.* S.Rəhimov. *Rəhim bəy hirsindən əfi ilan kimi fısıldadı.* M.Hüseyn.

3. *məc.* Klassik şeirdə: gözəlin qıvrım saçları bu ilana təşbeh edilir. *Əfi kimi daim zülfi-müsəlsəl; Qıvrım-qıvrım olub yatar yanında.* Q.Zakir. *Hərdən götür üzdən, gözəlim, əfiyi-zülfün.* Ə.Vahid. ☐ **Əfi baxışlı** *klas.* – ehtiraslı, cazibəli baxışlı. *Yenə səni gördüm, bağrım oxlandı; Ey əfi baxışlı, havalı sərxoş.* M.P.Vaqif.

**ƏFİL-ƏFİL** b a x **əsim-əsim**. *Əfil-əfil əsmək.*

**ƏFKAR** *is.* [*ər.* "fikr" söz. cəmi] Fikir. [Qətibə:] *Bu tədbir azərbaycanlıların bizim əleyhimizə olan hər bir təşəbbüsünə son qoyar. Xalqın əfkarı sakit olar.* M.S.Ordubadi. *Yormuşdu bütün ruhumu, əfkarımı aləm; Bir dağ ətəyində düşünürdüm təkü tənha.* A.Şaiq.

◊ **Əfkari-ümumiyyə** – bir şey haqqında ictimaiyyətin (xalqın, camaatın) fikri, rəyi, münasibəti. [Tehrani:] *Sərhəng, Azərbay-*

*candakı hadisələr dünya əfkari-ümumiyyəsini həyəcana gətirmişdir.* Ə.Məmmədxanlı. *Qəzetlər əfkari-ümumiyyəni toplamışdı.* Mir Cəlal.

**ƏFQAN** *is.* Əfqanıstanın əsas əhalisini təşkil edən, İran dilləri qrupuna daxil xalq və bu xalqa mənsub adam.

**ƏFQANISTANLI** *is.* Əfqanıstan əhalisinə mənsub adam.

**ƏFLAK** *is.* [*ər.* "fələk" söz. cəmi] *klas.* Fələk, göy. *Cəfa oxun mənə yağdırman, ancaq, ey əflak! Demin ki, yeddi kəmanda bir nişanə yetər.* Füzuli. *Sanma kim, ya qan doludur hər bahar əflakdən.* Kişvəri. *Düşdükcə o istəkli vətən səmtə nigahım; Əflakə ucaldı o zaman şöleyi-ahım.* A.Səhhət. [Cahangir ağa:] *Hamısı ac, çılpaq, zillətdə, əziyyətdə, fəryadları əflaka çıxmış.* S.S.Axundov.

**ƏFLATUN** Qədim Yunanıstanın ən böyük filosoflarından birinin adı olub, məcazi mənada "filosof, mahir həkim" mənasında işlənir. *Əflatun da gəlsə, sağalda bilməz. – ..Onlar hər fəziləti və şərəfi pulda görür, yoxsul, Əflatun belə olsa, onların nəzərində heçdir.* A.Şaiq. // Danışıq dilində bəzən "çoxbilmiş, hiyləgər, hərif" mənasında işlənir. *O, yaman Əflatundur, bacarmaq olmaz.*

**ƏFLATUNİ** *sif.* [*xüs.is.*-dən] Sırf mənəvi xarakter daşıyan, qeyri-şəhvani. *Əflatuni eşq* (*məhəbbət*). // Praktik məqsəd güdməyən, mücərrəd.

**ƏFRAD** *is.* [*ər.* "fərd" söz. cəmi] Fərdlər, şəxslər, adamlar. *Etiqadımız bundadır ki, vətən, məmləkət orada yaşayan əfradın hamısınındır.* C.Məmmədquluzadə. [Əbülhəsən bəy:] *Nəzmiyyə əfradının və onunla bərabər bütün Təbrizin tərk-silah etdirilməsi tələbini rədd edəcəyik.* M.S.Ordubadi. ☐ **Əfradi-məclis** *köhn.* – səhnə əsərində iştirak edən şəxslər. *Əfradi-məclisdən mövlananın əql və kəmalına afərin sədası səqfə bülənd oldu.* M.F.Axundzadə.

**ƏFSANƏ** *is.* [*fars.*] 1. Nəsillərdən nəsillərə ağızda dolaşan və mövzusu çox zaman fövqəladə xarakter daşıyan hekayə, rəvayət; əsatir. *Hind əfsanələri. Orta əsr əfsanələri.* – [Gənc çadırçı:] *Keçənlərdən bizə əfsanə qaldı; Sönüb Cəmşidi-cəm, peymanə qaldı.* H.Cavid. *Bəşər xəyallara qapanıb hərdən; Təsəlli bulmuşdur əfsanələrdən.* S.Vurğun. [Mirzə] *bütün Şərq ayin, əfsanələrini bilməyi ilə hamının diqqətini cəlb edirdi.* S.Rəhimov. // *məc.* Uydurma, nağıl, boş söhbət. *Əfsanə danışma yar deyə-deyə; Bülbül, gül yanında xar deyə-deyə.* Aşıq Pəri. [Sabbah:] *Nə olur, böylə azıb getsə bəşər; Səncə, əfsanəmidir xeyr ilə şər?* H.Cavid. *Sevgilim, eşq olmasa varlıq bütün əfsanədir; Eşqdən məhrum olan insanlığa biganədir.* Ə.Vahid.

2. Dillərə düşmüş, geniş yayılmış vəqə, dastan, hekayət. *Əbəs sözdür bu əfsanə; Düşübdür xalqın ağzına; Gərək Məcnun, gərək Leyla; Veribdirlər canın cana.* Füzuli. *Sən öz gözəlliyinlə; Sirr dolu əfsanələr; Nağıllar yaratmısan.* B.Vahabzadə.

**ƏFSANƏÇİ** *is.* Nağılçı, əfsanə uyduran.

**ƏFSANƏLİ** *sif.* Əfsanələrlə dolu, əfsanələrdən ibarət. *Əfsanəli nağıl.* – *Qaranlıq gecələrdə; Karvanlar keçir ikən; Yurdunun əfsanəli; Yoncalı yollarından.* Ə.Cavad. [Ana:] *Yenə səfərin haradır, oğul? – dedi. Ovçu başını qaldıraraq*: *– Uzaqlara, anacan, – dedi, – uzaqlara, .. əfsanəli dağlara.* Ə.Məmmədxanlı.

**ƏFSANƏVİ** *sif.* [*fars.*] 1. Əfsanə mahiyyətində olan, nağıl qəbilindən olan, əfsanəyə aid olan; əsatiri. *Əfsanəvi əsər.* – *Bəzən əfsanəvi bir mələk kimi; Uçursan o mavi asimanlara.* S.Vurğun. *Uzaqdan dağların zirvəsi neçə min illərlə əriyib tükənmək bilməyən qarı ilə əfsanəvi bir quşa bənzəyir.* R.Rza.

2. *məc. tənt.* Qeyri-adi, fövqəladə, misli görünməmiş. *Əfsanəvi qəhrəmanlıq. Əfsanəvi gözəllik.* – *Gülsənəm arvad öz tərifindən ruhlanır, ruhlandıqca da, elə bil, qeyri-adi, əfsanəvi bir hadisədən danışırdı.* M.Hüseyn. // *məc.* Nağıllarda olduğu kimi; xəyali. *İki həftə əvvəl milyon işıqları ilə əfsanəvi bir şəhəri xatırladan Bakı, artıq qaranlıq içərisində idi.* Ə.Məmmədxanlı. *Lap yaxından baxırıq; Bizə uzaqdan baxan; Əfsanəvi Aya biz.* B.Vahabzadə.

**ƏFSANƏVİLİK** *is.* Əfsanəvi olma, qeyri-adilik.

**ƏFSƏR** *is.* [*alm.* "offizier"dən] Zabit. [Allahverdi:] *Əynində əfsər paltarı, düymə-*

*ləri qızıl kimi par-par parıldayır.* C.Cabbarlı. *Gözəl-gözəl xanımlar əfsərlər ilə qol-qola verib gəzirdilər.* Ə.Haqverdiyev. *Bir anda bir daraq güllə boşaltdın; Ağzıyla yer qapdı alman əfsəri.* S.Vurğun.

**ƏFSUN** *is.* [*fars.*] Ovsun, sehr. *Bilməzəm kim, ona təlim nə əfsun etdi.* Füzuli. *Cadu da əlimdən bacarıb cin də qutarmaz; Əfsunuma bah-bah!* M.Ə.Sabir. // Ovsun duası. *..Mədrəsə müəllimi dərs əvəzinə uşaqlara əfsun yazıb paylayır ki, ilan sancmasın.* C.Məmmədquluzadə.

**ƏFSUNÇU** *is.* Ovsunçuluqla, sehrbazlıqla məşğul olan adam; ovsunçu, sehrbaz, gözbağlayıcı. [Papas:] *..Əfsunçudur, divanədir, aldanmayın, aldanmayın!* H.Cavid.

**ƏFSUNÇULUQ** *is.* Ovsunçunun işi, peşəsi; sehrbazlıq, gözbağlayıcılıq.

**ƏFSUNKAR** [*fars.*] b a x **əfsunçu.** // Füsunkar. [Şeyx Sənan:] *Bəlkə məcnunəm, eyləməm inkar; Bais ancaq o hüsni-əfsunkar.* H.Cavid.

**ƏFSUNKARLIQ** b a x **əfsunçuluq**.

**ƏFSUNLAMA** "Əfsunlamaq"dan *f.is.*

**ƏFSUNLAMAQ** *f.* Ovsunlamaq, sehrləmək. *Öylə bir incə təravət vardı; Ki, bütün gözləri əfsunlardı.* H.Cavid. *Züleyxanın iri, qara gözləri kimin üzünə gülsəydi, onu əfsunlamazdı?* C.Cabbarlı.

**ƏFSUNLANMA** "Əfsunlanmaq"dan *f.is.*

**ƏFSUNLANMAQ** *məch.* Ovsunlanmaq, sehrlənmək.

**ƏFSUNLU** *sif.* Ovsunlu, ovsunlanmış, sehrlənmiş. *Qadınlar köhnə məscidi əfsunlu ayələrdən, Quran vərəqələri, zibil və torpaqdan təmizləyir, barama torlarına yer düzəldirlər.* Mir Cəlal.

**ƏFSUS** *nida* [*fars.*] Heyif, təəssüf. *Yox səndə nişani-namü namus; Əfsus ki arsızsan, əfsus!* Füzuli. *Əfsus, qocaldım, ağacım düşdü əlimdən; Səd heyif cavanlıq!* M.Ə.Sabir. [2-ci cariyə:] *Nazlı məlikəmiz Südabə, əfsus! Hər sevincə qarşı kədərli, məyus!* H.Cavid. ☐ **Əfsus etmək (eləmək)** – təəssüflənmək, təəssüf etmək, heyifsilənmək. *Oldular ol şikardan məyus; Etdilər çox təəssüfü əfsus.* S.Ə.Şirvani. *Əmioğlu, mən artıq əfsus eləyirəm ki, biz ölüb gedəcəyik..* C.Məmmədquluzadə. *Oğlanların məktəbdən çıxarılmalarına çox əfsus edirəm.* Ə.Haqverdiyev.

**ƏFŞAN** *sif.* [*fars.*] *şair.* Səpən, saçan, dağıdan, səpələyən. ☐ **Əfşan etmək** – səpmək, səpələmək, dağıtmaq, tökmək, saçmaq. *Gülgun sərəndazın tazə gül kimi; Əfşan etmiş ay qabağın üstündən.* M.P.Vaqif. *Camalın şövqündən artıbdır dərdim; Əfşan elə zülfün ay üzə tək-tək.* Aşıq Ələsgər.

**ƏFV** *is.* [*ər.*] Günah və qüsurunu nəzərə almama, günah və təqsirindən keçmə, günahı bağışlama. [Yusif:] *Əfvinlə sevinməz könül, əfsus; Zalım yenə zalımdır.* H.Cavid. *Şəfiqənin gülüşündə kin yox idi, bu gülüş bəlkə də əfv idi.* Ə.Məmmədxanlı. ☐ **Əfv edərsiniz, əfv ediniz** – bağışlayın, üzr istəyirəm. [Yaşlı kişi:] – *Əfv edərsiniz, – dedim, – mən nabələd adamam, nəzirim nə qədər olacaq?* S.Hüseyn; // bəzən nəzakətli etiraz yerində. *Əfv edərsiniz, məsələ elə deyil.* **Əfv etmək** – 1) günahından keçmək, təqsirini bağışlamaq. *Sənin təqsirini əfv etmək olmaz. – Mehriban Zeynalı əfv etmək istəyirdi. Onu yenə sevə bilərdi.* S.Hüseyn. *Mən rica edirəm ki, bu dəfəlik bəy əfv eləsin.* H.Nəzərli. *Əfv etdim hər şeyi, əfv etdim sənə; O soyuq sözləri, o gülüşləri.* R.Rza; 2) üzrlü saymaq. *Məni əfv edin, sizi yola sala bilməyəcəyəm. Gecikdiyim üçün məni əfv edin.* **Əfv olunmaq** – günahından, təqsirindən keçilmək, təqsiri bağışlanmaq. [Həsən:] *İndi bəlkə əfv oluna biləsən.* H.Nəzərli.

**ƏFVEDİLMƏZ** *sif.* Əfv oluna bilməyən, bağışlanılmaz, bağışlanması mümkün olmayan. *Əfvedilməz hərəkət, günah.* – [Nadir bəy:] *Aciz bir qarıncanın belə qanına girmək, məncə, əfvedilməz bir cinayətdir.* H.Cavid.

**ƏFVİ-ÜMUMİ** *is. hüq.* Ali hökumət orqanının fərmanı ilə məhkumların məhkəmə cəzasından qismən, ya da tamamilə azad edilməsi; amnistiya. *Cəzanın bir qismi məşrut idi, bir qismi də əfvi-ümumiyə çıxıldı.* S.Hüseyn. *Mən yüzlərlə anaların ərizəsi ilə* [şahın] *baş vəzirinin istiqbalına çıxıb, Təbriz ziyalıları adından məhbuslara əfvi-ümumi istəyəcəyəm.* Ə.Məmmədxanlı.

**ƏFYUN** *is.* [*lat.* "opiom"dan] Tiryək. [Nəcəf bəy:] *Tiryakınıza lənət, mütrübünüzə lənət, əfyun gəzdirən dərvişlərinizə lənət, yalançı seyidlərinizə, siğəxanlarınıza lənət...*

N.Vəzirov. *Gah sünni deyər ki, şiədir bu; Əfyunə uyub şərabi olmuş.* A.Səhhət.

**ƏFYUNÇU** *is.* Tiryəkçi, tiryəkçəkən.

**ƏFYUNLU** *sif.* Tiryəkli, içərisində tiryək olan. // *məc.* Zəhərli, acı. [Yusif:] *Onlar nə verirlər sana? Əfyunlu hədiyyə!* H.Cavid.

**ƏFZA** *sif.* [*ər.*] *köhn.* Artıran. *Gərçi qış fəsli idi, leyk həva; Rövşənü saf idi fərəh əfza..* M.Ə.Sabir.

**ƏFZƏL** *sif.* [*ər.*] *klas.* Daha artıq, daha qiymətli, daha üstün tutulan. *Hər kimsənə bir şey gətirir fikrü xəyalə; Məcmudən əfzəldi mənə yar xəyalı.* S.Ə.Şirvani. [Nənəcan] *bir qarından ötrü ərə getməkdənsə, dul yaşamağı əfzəl bilirdi.* N.Nərimanov. [Səriyyə:] *Rüstəm, bunların rəhminə güvənməkdənsə, dəryada iynə üstünə minib xilas olmağa güvənmək daha əfzəldir.* C.Cabbarlı.

**ƏFZƏLİYYƏT** *is.* [*ər.*] *klas.* Üstünlük, daha qiymətlilik, üstün tutma. *Bir xəyal edə bilmir ki, bunlar niyə gərək bu əfzəliyyətə səzavar olsunlar?* M.F.Axundzadə.

**ƏFZUN** *zərf* [*fars.*] *klas.* Çox, daha artıq. *Sədəf dəhanından çıxan sözlərin; Qiyməti əfzundur dürdanələrdən.* Q.Zakir. □ **Əfzun olmaq** – artmaq, çoxalmaq. *Əfzun olur ol qəmü məlamət; Mümkün deyil oğluna səlamət.* Füzuli. *Necə yar eyləsə bipərvalıq; Olur əfzun könüldə şeydalıq.* Əmani. **Əfzun etmək (qılmaq)** – artırmaq, daha da çoxaltmaq. *Qılmış hüsnün şövqü dərdimi əfzun; Ayrılıq qəmində göz yaşım Ceyhun.* M.P.Vaqif. *Uşaq ikən eşqə düşdüm, bilmədim; Əfzun etdi varə-varə dərdimi.* Aşıq Abbas.

**ƏGƏR[1]** *bağl.* [*fars.*] Şərt bildirən cümlənin müxtəlif yerində işlənərək şərti gücləndirir. [Orxan:] *Zərər yox, onu mən sağ qoysam əgər; Dünyada yox məndən alçaq bir nəfər.* H.Cavid. [Ağa:] *Əgər desəm qiyamət bərpa olmuşdu, inanın.* Ə.Haqverdiyev. [Dərviş:] *Əgər mənim başıma gələndən xəbərin var isə, niyə məni söylətmək istəyirsən?* A.Divanbəyoğlu.

**ƏGƏR[2]** bax **əgər-əskik**.

**ƏGƏRÇİ** *bağl.* [*fars.*] *klas.* Hərçənd, hər nə qədər olsa da, ..isə də. *Hər kanda əgərçi ləl çoxdur; Bir ləl ki layiq ola yoxdur.* Füzuli. *Görmüşəm ləlini lazımdı tökülsün qanım; Etibar olmaz əgərçi görələr qan yuxuda.* S.Ə.Şirvani. [İbn-Yəmin:] *Aylarca əgərçi ayrı düşdük; Qismət bu, yenə bu gün görüşdük.* H.Cavid.

**ƏGƏR-ƏSKİK** *is.* Tamam olmayan, çatışmayan cəhətlər, şeylər, ehtiyac olunan şey. *Vaqeən* [Ağaverdinin] *min manat pula böyük bir ehtiyacı varmış. Bu min manat evinin bütün əgər-əskiyini düzəldə biləcəkmiş.* S.Hüseyn. [Əmrulla:] *Qoy oyun qurtarsın, sonra yığışarıq, danışarıq, hər nə əgər-əskiyi olsa, hamısını düzəldərik.* C.Cabbarlı. *İbadovun evində kəndin yaxşı işlərindən, gözəl adamlarından xeyli danışdılar.* R.Rza.

**ƏGƏR-ƏSKİKLİK** *is.* Nöqsan, kəsir, çatışmazlıq, qeyri-mükəmməllik. *İşdə əgər-əskiklik var.*

**ƏGƏR-MƏGƏR** *is. dan.* Şərt, şərt qoyma. [Şiraslan:] *Burada analitik dəqiqlik var, sizin əgər-məgərlər kara gəlmir.* M.Süleymanov.

**ƏĞLƏB** *sif.* [*ər.*] *köhn. kit.* Çox, ən çox, əksəriyyət. *Doğru imiş, şairin olmaz imiş məzhəbi! Kafir olurmuş bütün mirzələrin əğləbi.* M.Ə.Sabir. *..İslam şəriətinə qail olan Təbrizdə əğləb müsəlmana rast gəlirsən, – onu kefli görürsən.* C.Məmmədquluzadə.

**ƏĞNİYA** *is.* [*ər.* “ğəni” söz. cəmi] *köhn. kit.* Zəngin adamlar, varlılar, dövlətlilər. *Bu əğniyaların üzün görüncə ehtiyacdan; Get, ey fəqiri-binəva, kəfən bürün, məzarı gör!* M.Ə.Sabir. *..Vaizlərimiz minbərə çıxıb əvvəl xanlarımıza, əğniyalarımıza, qolu çomaqlılarımıza və qocalarımıza rəhmət oxuyub axırda deyəcəklər.* C.Məmmədquluzadə.

**ƏĞYAR** *is.* [*ər.* “ğeyr” söz. cəmi] *klas.* Özgə(lər), dost olmayan(lar); rəqib(lər), yad(lar). *Bu gələn yar özüdür; El-obanın gözüdür; Bu tənə sənin deyil; Bəlkə əğyar sözüdür.* (Bayatı). *Gül qönçəlikdə gərçi olur xarə aşina; Açsa niqabını, olur əğyarə aşina.* S.Ə.Şirvani. [Məşədi İbad:] *İndi mən bu tayda hambal ilə qalmışam; Yarım da o tayda əğyar ilə söhbət edir.* Ü.Hacıbəyov.

**ƏĞYARLIQ** *is. klas.* Düşmənlik, rəqiblik, yadlıq. *Təneyi-əğyar çəkməkdir işim bir yar üçün; Kim, olub əğyarə yar, eylər mənə əğyarlıq.* Füzuli.

**ƏH** bax **eh**.

**ƏHALİ** *is.* [*ər.* “əhl” söz. cəmi] 1. Bir yerdə yaşamaqda olan adamlar; camaat. *Şəhər*

*əhalisi. Kənd əhalisi. Rayonun əhalisi. – Təbrizdə bu saat qəhətlikdir və əhali çörək üzünə həsrətdir.* C.Məmmədquluzadə. *Əhalisinin çox qismi qışlaqda yaşayan bu böyük kənd, qarlar altında qalmış bir məzarıstana bənzəyirdi.* S.Hüseyn. *Biz öz məqsədimiz üçün yerli əhalidən dürlü yollar ilə istifadə etməli idik.* H.Nəzərli.

2. Bir ölkənin sakinləri, camaatı, xalqı. *Əhalinin siyahıyaalınması. Əhalinin sayı. Əhalinin artımı. – Hökumət birinci dumanı buraxdı. Fevral ayında ikinci bir duma açılacağını əhaliyə elan etdi.* Ü.Hacıbəyov. *Əhalinin xeyli qismi hələ cəbhələrdə vuruşurdu.* Ə.Sadıq.

**ƏHALİSİZ** *sif.* Əhalisi olmayan, əhali yaşamayan.

**ƏHALİSİZLİK** *is.* Əhalisi olmama, əhali yaşamama.

**ƏHATƏ** *is.* [*ər.*] Ətrafını tutma, dövrələmə, dörd tərəfini tutma. *Səlim adamların əhatəsində tərini silə-silə yeriyirdi.* S.Rəhimov. ◻ **Əhatə etmək** – 1) bax **əhatələmək**. *Şənbə günü sübhdən padşahlıq sarayını əhatə etsinlər və içəri daxil olub Yusif şahı taxtdan yerə salıb həlak etsinlər.* M.F.Axundzadə. *Düşmənlər hər tərəfdən şəhəri əhatə etmişdi, şəhər darvazaları tamamən bağlanıb, dallarına qalın torpaq çəkilmişdi.* Çəmənzəminli. *Ətrafı düşmən əhatə edibdir.* M.S.Ordubadi; 2) *məc.* qavramaq. *Bütün məsələləri əhatə etmək mümkün olmadı. – Görünür, mənim ərz etdiklərimi lazımınca əhatə edə bilməmişsiniz.* M.S.Ordubadi. *Mirzə Fətəlinin komediyaları böyük ictimai məsələləri əhatə edən, komik planda ictimai xarakterlər yaradan klassik komediya əsərləri idi.* M.İbrahimov. **Əhatə olunmaq** – bax **əhatələnmək**. *Bizim* [Xəzər] *dənizinin suyu acı da olsa, hər bir tərəfdən quru ilə əhatə olunduğu üçün göl hesab olunur.* H.Zərdabi. *Bəsti gənclərlə əhatə olunmuş halda qapıdan içəriyə girdi..* Ə.Sadıq. [Ağbulaq kəndi] *sıldırımlı dağların geniş ətəyində yerləşərək hər tərəfdən meşə ilə əhatə olunmuşdur.* S.Rəhimov. **Əhatəyə almaq** – bax **əhatə etmək**. *Faytonu əhatəyə aldılar. İki milis qabaqda, iki milis arxada, ikisi də yanda dərəyə endilər.* İ.Şıxlı.

**ƏHATƏEDİCİ** *sif.* Dövrələyici, hər tərəfi qavrayan. *Katib əhatəedici nəzəri ilə ətrafa nəzər saldı.* Mir Cəlal.

**ƏHATƏLƏMƏ** "Əhatələmək"dən *f.is.*

**ƏHATƏLƏMƏK** *f.* Əhatə etmək, əhatəyə almaq, dövrələmək, dövrəyə almaq, dörd tərəfini tutmaq.

**ƏHATƏLƏNMƏ** "Əhatələnmək"dən *f.is.*

**ƏHATƏLƏNMƏK** *məch.* Əhatə olunmaq, əhatə edilmək, əhatəyə alınmaq, dövrəyə alınmaq, dörd tərəfi tutulmaq. *Meyvə bağları ilə əhatələnmiş güllü-bağçalı böyük həyətimizdə bizdən başqa iki əmioğlumun da ailəsi yaşayırdı.* S.S.Axundov.

**ƏHATƏLİ** *sif.* Geniş, hərtərəfli, əhatə dairəsi geniş olan. *Əhatəli əsər. – Belə oldu nəticə: – Daha əhatəli iclas çağırılsın; Yaxın bir gün; Ətraflı danışmaq üçün.* R.Rza.

**ƏHATƏLİLİK** *is.* Genişlik, hərtərəflilik.

**ƏHD** *is.* [*ər.*] 1. Öhdəsinə alma, söz vermə, üzərinə götürmə; and. *Əhdini yerinə yetirmə. – Yadlar ilə sürər oldun səfanı; Tərk etdin iqrarı, əhdi, vəfanı.* Q.Zakir. ◻ **Əhd qılmaq (bağlamaq)** *klas.* – bax **əhd etmək**. *Əhd qıldın ki, cəfa kəsməyəsən aşiqdən; Aşiqi vədeyi-ehsan ilə məmnun etdin.* Füzuli. [Səriyyə:] *Bir-biri ilə əhd bağlamışdıq, ölənəcən bir-birindən ayrılmayaq.* C.Cabbarlı. **Əhd etmək (eləmək)** – söz vermək, and içmək. *Əhd etdi dil ki, bağlana zəncir zülfünə.* S.Ə.Şirvani. *..Əhd edib mən ürəklə and içdim.* H.Cavid. **Əhdə vəfa etmək** – verdiyi sözü, əhdini, andını yerinə yetirmək. [Səriyyə:] *Rüstəm, əhdinə vəfa et!* C.Cabbarlı. [Minnət xanım:] *Mən əhd eləmişdim ki, qonaqların içində üzümü* [Mərcan bəyə] *göstərim, indi əhdimə vəfa edirəm.* Ü.Hacıbəyov. *Əhdinizə vəfa edin; Pozmayın ilqarı, qızlar!* Aşıq Hüseyn. **Əhdə durmamaq** – bax **əhdindən dönmək (keçmək)**. **Əhdindən qaçmaq** – bax **əhdindən dönmək (keçmək)**. *Nilufərəm, açmaram; Ətrim bica saçmaram; Yar yolunda baş qoysam; Öz əhdimdən qaçmaram.* (Bayatı). **Əhdindən dönmək (keçmək)** – vədini yerinə yetirməmək, sözünə əməl etməmək, sözündən qaçmaq. [Şərəf xanım:] *İndi nə olubdur ki, əhdindən dönüb, qızını öz yaşında yoldaşına verirsən?!* S.S.Axundov. [Sə-

riyyə:] *Hər cür əziyyətə, məşəqqətə, hətta ölümə də razı olub əhdimizdən dönməyək.* C.Cabbarlı. **Əhdinə vəfasız çıxmaq** – vədini unutmaq, verdiyi sözə əməl etməmək. *Əhdə çıxsam vəfasız; Onda məni qına, yar!* R.Rza. **Əhdinə çatmaq** – arzusuna çatmaq. *Qoy öpüm al yanaqdan; Mən də çatım əhdimə.* (Bayatı). **Əhdi(ni) qırmaq (sındırmaq, pozmaq)** – b a x **əhdindən dönmək (keçmək)**. *Zeynal yalan söyləyib Mehribanı aldatmaqla öz əhdini sındırır, şərtini pozurdu.* S.Hüseyn. [Nüşabə:] *Olsa yer, göy mənə qarşı əlbir; Pozmaram əhdi, sözüm birdir, bir!* A.Şaiq. *Gün çıxar, dağların əriyər qarı; Pozulmaz dostların əhdi, ilqarı..* N.Rəfibəyli.

2. Sözləşmə, əhdləşmə, əhdnamə, müqavilə. *Qardaşlıq əhdini yazmağa gəldim; Köhnə haqsızlığı pozmağa gəldim.* Ə.Cavad. ☐ **Əhd bağlamaq** – razılığa gəlmək, qərara almaq, bir-birinə söz vermək. *Sən əhd bağladın, ulduzlar oldu şahidimiz; Sitarələr utanır indi, ey nigar, məndən.* Şəhriyar. **Əhd bağlanmaq** – razılıq əldə edilmək, qərara alınmaq.

3. *köhn.* Çağ, vaxt, zaman, dövr.

◊ **Əhdi kəsilmək** – b a x **əhədi kəsilmək** (**"əhəd"**də). [Qəşəm:] *Torpağı ki böldük, düşmənin əhdi kəsiləcək.* Mir Cəlal.

**ƏHDİ-CƏDİD** *is.* [*ər.*] *din.* İncilin və Bibliyanın xristianlığa aid olan digər kitablarının adı.

**ƏHDİ-ƏTİQ** *is.* [*ər.*] *din.* Tövrat və təfərrüatı (Bibliyanın xristianlıqdan qabaqkı ən qədim hissənin adı). *Rəfayel tablosutək səhnələri Əhdi-ətiqdən; Doymasan köhnə rəfiqdən.* Şəhriyar.

**ƏHDLƏŞMƏ** "Əhdləşmək"dən *f.is.*

**ƏHDLƏŞMƏK** *qarş.* Bir-birinə söz vermək, sözləşmək, əhd-peyman etmək, bir-biri haqqında təəhhüd altına girmək.

**ƏHDNAMƏ** *is.* [*ər.* əhd və *fars.* ...namə] Müahidənamə, razılaşma kağızı, müqavilənamə, bağlaşma. [Məşədi Kazımağa:] *Dövlətimizin əcnəbilərlə bağladığı təhqiramiz əhdnamə buna imkan vermirdi.* M.S.Ordubadi. // Təəhhüd kağızı. [Zeyd:] *Düşməni məğlub və pərişan etdik. Söz verdi, on il bizimlə dava etməsin. Budur əhdnaməsi.* Ü.Hacıbəyov.

**ƏHD-PEYMAN** *is.* [*ər.* əhd və *fars.* peyman] Bir-birinə təntənəli surətdə söz vermə, əhdləşmə. *Bir xeyli zamandır, getdi gəlmədi; Əhd-peymanına qurban olduğum.* Ə.Cavad. *Mənə elə gəlir ki, bu söhbətlər əbəsdir. Belə əhd-peymanlar, nəsihətlər əbəsdir.* S.Rüstəm. ☐ **Əhd-peyman bağlamaq** – b a x **əhd-peyman etmək**. *Nigar xanım atasının yanından durub birbaş gəldi reyhanlığa, həmin yerdə ki Məstanla görüşüb əhd-peyman bağlamışdı.* (Nağıl). **Əhd-peyman etmək** – bir-birinə təntənəli surətdə söz vermək, əhdləşmək, andlaşmaq. *İki həsrətli əhd-peyman edib ayrıldılar.* "Aşıq Qərib". *İstəyirsən səninlə bu barədə əhd-peyman edim.* S.S.Axundov.

**ƏHEY** b a x **ey**. [Qazan xan:] *Əhey, quldurbaşı, təpə dalında nə durursan, ərsən irəli gəl!..* M.Rzaquluzadə.

**ƏHƏD: əhədi kəsilmək (üzülmək)** – bərk yorulmaq, əldən düşmək, gücdən düşmək, taqətdən düşmək, üzülmək; **əhədini kəsmək (üzmək)** – 1) tamam əldən salmaq, bərk yormaq, üzmək, şiddətli təsir etmək. *Qızdırma əhədimi kəsdi. Soyuq əhədimi üzdü. – Sərkərdə deyir: – Filan davada düşmən bizim lap əhədimizi kəsmişdi.* "M.N.lətif." *Düşmən padşahın qoşununun lap əhədini kəsdi.* (Nağıl); 2) öldürmək. [Məşədi İbad Sərvərə:] *Qurban olasan bu altımdakı hambala, yoxsa əhədini kəsərdim.* Ü.Hacıbəyov.

**ƏHƏMİYYƏT** *is.* [*ər.*] Mühümlük, qiymətlilik, dəyərlilik; rol, dəyər. *Məsələnin əhəmiyyəti. Çıxarılan nəticələrin əhəmiyyəti. Tədbirin əhəmiyyəti. Müzakirənin əhəmiyyəti. – ...Ailədə məktəbəqədər tərbiyənin xüsusi əhəmiyyəti vardır.* S.Rəhimov. ☐ **Əhəmiyyət qazanmaq (kəsb etmək)** – diqqəti cəlb etmək, nəzərə alınmasını tələb etmək, vacib olmaq. *Məsələ çox böyük əhəmiyyət qazanmışdır.* **Əhəmiyyət vermək** – çox lazımlı, çox dəyərli, çox vacib hesab edərək nəzərə almaq, diqqət yetirmək. *Məsələyə ciddi əhəmiyyət vermək;* // məna vermək, fikir vermək. *Onun dediklərinə çox əhəmiyyət vermə. – Mehriban onun hərəkətinə əvvəlki qədər əhəmiyyət də vermirdi.* S.Hüseyn. [Qarı] *yolundakı saysız-hesabsız çiçəklərə əhəmiyyət vermədən dərəni kəsib keçdi.* Ə.Məmmədxanlı.

**ƏHƏMİYYƏTLİ** *sif.* Əhəmiyyəti olan; mühüm. *Əhəmiyyətli məsələlərdən biri. Əhəmiyyətli iş. Əhəmiyyətli hadisə. Əhəmiyyətli qərarlar. – Bakıda başlanan işlər bütün xalqın gələcək taleyi üçün çox əhəmiyyətli idi.* M.İbrahimov. *Məktəbin divar qəzeti özünə görə nə qədər vacib və əhəmiyyətli olsa da, o, əlyazması halında, özü də tək bircə nüsxə çıxarılıb divardan asılır.* S.Rəhimov. [Mahmudun] *bu dedikləri .. əhəmiyyətli* (z.) *və etibarlı sayılırdı.* Ə.Əbülhəsən.

**ƏHƏMİYYƏTLİLİK** *is.* Mühümlük, əhəmiyyətli olma, əhəmiyyət. *Mövzunun əhəmiyyətliliyinə söz yoxdur.*

**ƏHƏMİYYƏTSİZ** *sif.* Əhəmiyyəti olmayan, heç bir qiyməti olmayan, nəzərə çarpmayacaq dərəcədə kiçik, cüzi, dəyərsiz, ciddi olmayan, diqqətəlayiq olmayan. *Əhəmiyyətsiz məsələ. Əhəmiyyətsiz iş. Əhəmiyyətsiz yara. Əhəmiyyətsiz şey üstündə mübahisə.* – [Cəmil bəy:] *Görünür ki, bizim yerin adətindən xəbəriniz yox... Zor etmək deyil, insanı qəhr etmək belə, onlarca, əhəmiyyətsiz bir iş.* H.Cavid.

**ƏHƏMİYYƏTSİZLİK** *is.* Qiymətsizlik, qeyri-mühümlük, cüzilik, qeyri-ciddilik, diqqətəlayiq olmama. *Məsələnin əhəmiyyətsizliyi. Hadisənin əhəmiyyətsizliyi.*

**ƏHƏNG** *is.* [*fars.*] Əhəngdaşını yandırmaqla əldə edilən ağrəngli, kəsək halında material. [Qərənfil:] *Keçən il təşəbbüs qaldırdınız ki, təzə yasli tikək, düzün ortasına bir-iki araba əhəngdən, qumdan tökdünüz, qaldı yağışın altında.* İ.Əfəndiyev. // Əhəng məhlulu. *Evin divarlarını əhənglə ağartmaq. – Bağ işçiləri maşından ağacın dibinə əlavə mədəni gübrə tökdülər və yaxud iri firçalarla ağacların gövdəsinə əhəng çəkdilər.* Ə.Sadıq. □ **Əhəng kürəsi** – əhəngdaşını bişirib əhəng hasil etmək üçün sadə ocaq, soba; kürəxana. *Əhəng kürəsində əhəngdaşı bişirilir və ondan əhəng istehsal edilir.*

**ƏHƏNGÇİ** *is.* Əhəngyandıran adam. // Əhəngsatan adam.

**ƏHƏNGDAŞI** *is.* Tərkibində əhəng olan çöküntü süxur – inşaat materialı. *Əhəngdaşını yandırıb əhəng alırlar. Əhəngdaşından tikilmiş ev. – Çökmə süxurların dənizdə əmələ gələn növlərinə misal olaraq qumdaşı, əhəngdaşı, gil və s.-ni göstərmək olar.* M.Qaşqay.

**ƏHƏNGLƏMƏ** "Əhəngləmək"dən *f.is.*

**ƏHƏNGLƏMƏK** *f.* 1. Suda həll edilmiş əhənglə ağartmaq. *Evlərin divarlarını əhəngləmək.*

2. Üstünə əhəng tökmək, əhəng qatmaq.

**ƏHƏNGLƏNMƏ** "Əhənglənmək"dən *f.is.*

**ƏHƏNGLƏNMƏK** *məch.* 1. Əhənglə ağardılmaq. *Ağacların gövdəsi əhənglənmişdir.*

2. Üstünə əhəng tökülmək, əhəng qatılmaq.

**ƏHƏNGLƏŞMƏ** "Əhəngləşmək"dən *f.is.*

**ƏHƏNGLƏŞMƏK** *f.* Əhəngə çevrilmək, əhəngdaşına dönmək. *Əhəng palçığı quruyandan sonra yavaş-yavaş əhəngləşir.*

**ƏHƏNGLƏTDİRMƏ** "Əhənglətdirmək"dən *f.is.*

**ƏHƏNGLƏTDİRMƏK** *icb.* Əhəngləmə işi gördürmək, əhənglə ağartdırmaq. *Qonşumuz otağını əhənglətdirmişdir.*

**ƏHƏNGLƏTMƏ** "Əhənglətmək"dən *f.is.*

**ƏHƏNGLƏTMƏK** *icb.* Əhəngləmə işi gördürmək, əhənglə ağartdırmaq. *Rəngsaza həyətin divarlarını əhənglət.*

**ƏHƏNGLİ** *sif.* 1. İçərisində, tərkibində əhəng olan, əhənglə qatışıq. *Əhəngli kükürd. Əhəngli sular. Əhəngli gübrələr.*

2. Əhənglə ağardılmış. *Əhəngli divarda taxtabiti az olar. – Faraların işığı artırmanın əhəngli divarını yalayıb ötdü.* İ.Məlikzadə.

3. Əhəngə bulaşmış. *Əhəngli üst-baş.*

**ƏHƏNGO** *is. məh.* Əhəngli su.

**ƏHƏNGSATAN** *is.* Əhəng satmaqla məşğul olan adam; əhəngçi.

**ƏHƏNGSƏPƏN** *is. xüs.* Qumun və s.-nin üstünə əhəng səpmək üçün inşaat işlərində işlədilən maşın və s. qurğu.

**ƏHƏNGSÖNDÜRƏN** *sif. xüs.* Əhəng hazırlanması işlərində işlədilən maşın və s. qurğu.

**ƏHƏNGYANDIRAN** *is.* Əhəng hazırlayan usta; əhəngçi.

**ƏHKAM** *is.* [*ər.* "hökm" söz. cəmi]. 1. Hər hansı bir dini təlimin, yaxud nəzəriyyənin rəddolunmaz və mütləq yerinə yetirilməli olan əsas və dəyişməz müddəaları, qanun-

ları. *Roma hüququ əhkamları. Dini əhkamlar. – Əhkami-şərə mütabiq bir kimsənə nəzərdə varmı ki, səltənəti və təxtü tacı ona vagüzar edək.* M.F.Axundzadə.

2. Bütün dövrlər və tarixi şərait üçün mütləq və dəyişməz qanun kimi qəbul edilən müddəa.

**ƏHKAMCASINA** *zərf.* Əhkam kimi, əhkam şəklində, qeyri-tənqidi; sübutsuz-dəlilsiz, qəti olaraq.

**ƏHKAMÇI** *is.* Hər şeyi əhkam kimi qəbul edən və başqalarına da qəbul etdirməyə çalışan adam; əhkamçılıq tərəfdarı.

**ƏHKAMÇILIQ** *is. kit.* Hər şeyi əhkam kimi qeyri-tənqidi qəbul etmə; yalnız quru əhkamlara əsaslanan qeyri-tənqidi təfəkkür.

**ƏHKAMLAŞDIRILMA** "Əhkamlaşdırılmaq"dan *f.is.*

**ƏHKAMLAŞDIRILMAQ** *məch.* Əhkam halına salınmaq.

**ƏHKAMLAŞDIRMA** "Əhkamlaşdırmaq"-dan *f.is.*

**ƏHKAMLAŞDIRMAQ** *f.* Əhkam halına salmaq.

**ƏHL** *is.* [*ər.*] 1. *köhn.* Yiyə, malik, sahib (bu mənada adətən tərkibdə işlənir; məs.: sərvət əhli, dərd əhli. *Vidadi, xəstəyəm, günlər sanaram; Dərd əhliyəm, qəm hərfini qanaram.* M.V.Vidadi. *Qüvvətli təbiət də bizə baş əyir indi; Eşq əhliyik, hər yerdə bizim qüdrətimiz var.* Ə.Vahid. □ **Əhli-beyt** – 1) *köhn. klas.* – ev adamları, ailə, külfət. *İnsan öz əhli-beytindən kənar oldu, əlbəttə, onun üçün, bir növ narahatlıq hasil olacaq.* C.Məmmədquluzadə; 2) *din.* müsəlmanların Məhəmməd peyğəmbərin övladlarına verdikləri ad. *Əhli-beyt tərəfdarları olan şairlər ilkin çağlardan başlayaraq mərsiyə qoşmuş, qəmli şeirlərində Kərbəla müsibətini səsləndirmişlər.* Ə.Səfərli. **Əhli-dərd** – dərd əhli, dərdli, dərdi olan adam. *Fələk, bari, cəfalar eyləyib sən həm qəm artırma; Əlindən gəlmədisə əhli-dərdə çarəsaz olmaq.* S.Ə.Şirvani. **Əhli-dil** *şair.* – söz başa düşən, o birinin dərdindən xəbərdar olan adam, arif. *İşarət elədim, dərdimi bildi; Gördüm həm gözəldi, həm əhli-dildi.* Aşıq Ələsgər. [Xaqani:] *İstəyirəm ki, şah əhli-dil olsun; İqlimimiz belə mötədil olsun!* M.Rahim. *Zalim fələkin gərdişi atəşlərə yansın! Əvvəlcə nə cövr eyləsə, əhli-dilə eylər.* Ə.Vahid. **Əhli-divan** *rəs. köhn.* – divan (məhkəmə) işləri ilə məşğul olan adamlar, məhkəmə məmurları. **Əhli-dünya** – axirətə inanmayıb ancaq bu dünya ilə maraqlanan, bu dünya işləri ilə məşğul olan, bu dünyanın nemətlərindən faydalanan adam. *Baxarmı əhli-dünyayə; Gülündən ayrılan bülbül.* Aşıq Bülbül. *Əhli-dünyayə virdi lənətdir; Gecə-gündüz xəyali dövlətdir.* S.Ə.Şirvani. **Əhli-elm** – elm əhli, elmlə məşğul olan adamlar, elm xadimləri. *Cəfər, ey nuri-dideyi-Seyyid!.. Əhli-elmə həmişə hörmət qıl!* S.Ə.Şirvani. **Əhli-eşq** – eşq əhli, aşiq. *O məclis kim, ziyası olmaya şəmicamalından; Nə məclis, eyni zülmət, əhli-eşqə bir bəla məclis.* S.Ə.Şirvani. *İnan, əlbəttə, bir zaman olacaq; Əhli-eşq onda kamran olacaq.* A.Səhhət. *Ziyarətgahını gülbusələr təzyin edər hər an; Sən əhli-eşq için bir Kəbə yandırdın məhəbbətdən.* H.Cavid. **Əhli-əyal** – ailədə olanlar: ər, arvad, uşaqlar; ailə. *Əhli-əyalı ibarətdir bir anasından, bir arvadından və yeddi-səkkiz yaşında oğlundan.* C.Məmmədquluzadə. *Xanlar kimdir ki, yazıq kəndlilərin malına, canına, əhli-əyalına özlərini sahib edirlər.* C.Cabbarlı. *Haşım Məhəmmədin yanında bir müddət qalsın və bir qədər pul qazandıqdan sonra yenə qayıdıb əhli-əyali ilə xoşbəxt dolansın.* B.Talıblı. **Əhli-hal** – hal əhli, başa düşən, başqasının halından xəbər tutan. *Bir para əhli-hal olmayan gözəl; Zənəxdanı gizlər, yanağı çəkər.* Q.Zakir. *Əhli-hal eşq için, əvət, bayılır; Haydı, Zəhranı get çağır, ayılır.* H.Cavid. **Əhli-iman** – iman əhli, etiqadlı, dinə inanan adam. *Ağdam bazarında da nə qədər istəsəniz imanlı hacı, kərbəlayı və məşədi tapılar.. Hamısı əhli-iman, namaz qılan, oruc tutan müqəddəs mömin şəxslərdir.* Ə.Haqverdiyev. **Əhli-insaf** – insaf əhli, insaflı adam. *Xislətdə sadəyəm, eşqdə Qafam; Mən mürvət kanıyam, əhli-insafam.* Aşıq Şəmşir. **Əhli-kef** – kef əhli, vaxtını kefdə və xoş keçirən adam. *Əhli-kef adam. – ..Hər kəs görsə ki, hambal qəzet oxuyur, elə bilər ki, bir əhli-kef adamdır, çağırıb yük götürtməz*

*və pul da verməz.* Ü.Hacıbəyov. *Restoran bu gecə çox maraqlıdır; Əhli-kef insanlar aşıb-daşırlar.* S.Vurğun; // *dan.* vaxtını əyyaşlıqda keçirən adam. *Zəng çalınır; Gəlin qalxır, qapını açır; Zümzüməylə girir evə "əhli-kef" əri.* S.Vurğun. **Əhli-kəmal** *köhn.* – kamal sahibi, kamallı, ağıllı adam. *Bildim bu imiş sənin muradın; Kim, əhli-kəmal ola ibadın.* Füzuli. **Əhli-kitab** – islam dininə görə, göydən nazil olmuş müqəddəs kitablardan birinə inanan(lar) – müsəlmanlardan başqa yəhudilər ilə xristianlar. *Aldı əhli-kitab dünyanı; Şərh edirsən sən indi Quranı.* S.Ə.Şirvani. *Qızma, şeyxim, o da bir əhli-kitab; Baxalım nəzri nədir?* H.Cavid. **Əhli-qələm** *köhn.* – qələm əhli, qələm sahibi, yazıçı, mühərrir. *Leyk bir bax ki, bu gün Şirvanda; Gör neçə əhli-qələm var onda?* A.Səhhət. **Əhli-qərəz** – qərəzli adam, qərəzkar, ürəyində qərəz saxlayan adam. *Eyb bilər fəzlini əhli-qərəz; Çünki onun var ürəyində mərəz.* S.Ə.Şirvani. **Əhli-qiblə** *din.* – müsəlman, islam əhli. **Əhli-qübur** – qəbiristan əhli, ölülər. *Qazıb əhli-qübur içində məzar; Oldu mədfun qəbr ara Bozlar.* S.Ə.Şirvani. *Sizin olsun bu da, ey əhli-qübur! Abi-kövsər deyilən badə budur!* H.Cavid. **Əhli-məclis** – 1) məclisdə olanlar, iştirak edənlər. *Vəkil, vəzir, əhli-məclis hamısı oğlanın bu hünərinə məəttəl qaldılar.* (Nağıl); 2) səhnə əsərində iştirak edənlər. **Əhli-mərifət** – mərifətli adam. *Sanırsa zahid özün əhli-mərifət, əmma; Bilirmi, nolduğun olsa suali-hürriyyət?* Ə.Vahid. **Əhli-ruh** – ruh əhli, ruhlu adam. *Gör necə xələt verdi; Məlul könlüm aşdı, gözəl; Arifsən, əhli-ruhsan; Can sana peşkəşdi, gözəl!* Aşıq Ələsgər. **Əhli-savad** – savadlı, oxumuş. *...Mən əhli-savadam, yazı-pozu mənim gözümə ziyan eləyibdi.* C.Məmmədquluzadə. **Əhli-vəfa** *klas.* – vəfalı. *Yolunda müntəzirəm, can verim görəndə üzün; Cəfa çəkənlərin əhli-vəfasıyam, gözəlim!* Ə.Vahid. **Əhli-zələmə, əhli-zülm** *köhn.* – xalqı incidən, xalqa zülm edən, xalqa əziyyət verən adam (çar dövründə inzibati polis orqanları məmurlarına verilən ad). [Səkinə xanım:] *Əziz bəyin dədəsi əhli-zələmə idi, özü ki hələ divan qulluğuna girməyibdir?* M.F.Axundzadə. **Əhli-zövq** – zövq əhli, yaxşı zövqü olan adam. [Şeyx Hadi Şeyx Sənan haqqında:] *Onu idrak üçün kəmal istər; Əhli-zövq istər, əhli-hal istər.* H.Cavid. **Əhli-zülm** – zülmkar, zülm edən adam. *Əhli-zülmü necə, bərbad eylədi bir ləhzədə; Sən bizim dağlar pələngi qəhrəman Eldara bax!* S.Vurğun.

2. Bir yerdə sakin olan, daim bir yerdə yaşayan, bir yerin əhalisindən olan adam. *Kənd əhli* (*kəndlilər*). *Şəhər əhli* (*şəhərlilər*). – *..Axundu mən çoxdan tanırdım, özü də İran əhlidir.* C.Məmmədquluzadə. *Bu kəndin əhli həqiqətən çox avam idi.* Qantəmir.

3. Bacaran, bilən adam. *İşi əhlinə tapşır.*

4. Əhali. *Nə əhlimizdə ayıqlıq əlaməti görüneydi; Nə bir para oxumuşlarda bu zəkavət oleydi.* M.Ə.Sabir. [Qazı:] *Əzizim, .. üç-dörd nəfər kəndinizin əhlindən gətirərsən mənim yanıma.* C.Məmmədquluzadə.

**ƏHLİ** *sif.* [*ər.*] 1. Əhliləşdirilmiş, ələ öyrədilmiş; əhliləşmiş, ələ öyrənmiş. [Qəhrəman:] *Bununla belə* [fil] *özü çox həlim və yumşaq heyvandır. Bunu tutub əhli heyvan edirlər.* "Məktəb".

2. Görmüş, keçirmiş, yaxşı-pis gün görmüş, qanan. *Əhli adama dərd söylə.*

**ƏHLİ-XİBRƏ** *is.* [*ər.*] *hüq.* b a x **ekspertiza**. *Bir şəxsin anlaqsız olmasını, yəni məsuliyyətə qabil olmamasını müəyyən etmək üçün mütləq həmin şəxs tibbi əhli-xibrəyə göndərilməlidir.* V.Qəhrəmanov.

**ƏHLİLƏNMƏ** "Əhlilənmək"dən *f.is.*

**ƏHLİLƏNMƏK** b a x **əhliləşmək**.

**ƏHLİLƏŞDİRİLMƏ** "Əhliləşdirilmək"dən *f.is.* *Vəhşi heyvanların əhliləşdirilməsi.* – *Camışların əhliləşdirilməsinə çox qədim zamanlarda Asiyada başlanmışdır.* A.Ağabəyli.

**ƏHLİLƏŞDİRİLMƏK** *məch.* Əhli edilmək, ələ öyrədilmək. *Tülkü balası əhliləşdirilmişdir.*

**ƏHLİLƏŞDİRİLMİŞ** *f.sif.* Əhli edilmiş, ələ öyrədilmiş. *Əhliləşdirilmiş ayı. Əhliləşdirilmiş heyvan.*

**ƏHLİLƏŞDİRMƏ** "Əhliləşdirmək"dən *f.is.*

**ƏHLİLƏŞDİRMƏK** *f.* 1. Vəhşi heyvanı əhli etmək, ələ öyrətmək. *Bu gün bizə xidmət edən bütün heyvanları insanlar əhliləş-*

*dirmişlər. – İnsan öz arzusuna müvafiq olaraq vəhşi çəki balığının təbiətini dəyişdirmiş və onu əhliləşdirmişdir.* "Zoologiya".

2. *məc.* Adamlara alışdırmaq, onlarla ünsiyyət və ülfətə öyrəşdirmək. *O vəhşini bir qədər əhliləşdirmək lazımdır.*

**ƏHLİLƏŞMƏ** "Əhliləşmək"dən *f.is. Əhliləşmə təsiri ilə heyvanlarda bir sıra dəyişikliklər əmələ gəlmişdir.* "Ümumi zootexniya".

**ƏHLİLƏŞMƏK** *f.* 1. Əhli olmaq, ələ öyrəşmək (vəhşi heyvan haqqında).

2. *məc. zar.* Adamlara uyuşmaq, alışmaq; adamlarla ünsiyyət, ülfət etməyə öyrəşmək; cəmiyyətdə özünü aparmağa alışmaq.

**ƏHLİLƏŞMİŞ** *f.sif.* Əhli olmuş, ələ öyrəşmiş. *Əhliləşmiş dəvə.*

**ƏHLİ-SƏLİB** *is.* [*ər.*] *tar.* XI-XIII əsrlərdə Qərbi Avropa feodallarının, katolik kilsəsinin təşəbbüsü və təhriki ilə müqəddəs torpağı, yəni Fələstini müsəlmanların əlindən qurtarmaq bəhanəsi ilə Yaxın Şərq ölkələrinə etdikləri hərbi yürüşlərində iştirak edənlərə verilən ad (döşlərinə xaç (səlib) şəklində nişan vurduqları üçün tarixdə onlara belə ad verilmişdir). *Əhli-səlib müharibələri.*

**ƏHLİYYƏT** *is.* [*ər.*] 1. Ləyaqət, iqtidar, etibarlılıq, səlahiyyət. *Əhliyyəti çatmır. Bu işdə onun əhliyyəti var.*

2. Əhli etmə, ələ öyrətmə. *Buna görə də onları bir ev quşu kimi əhliyyətə almağı və həyata öyrətməyi bacarmalıyıq.* M.S.Ordubadi.

**ƏHMƏDİ-BİQƏM** *is. dan.* Qəmsiz, dərdsiz, qayğısız adam. *Əhmədi-biqəmin biridir. – Ancaq qızın bu qədər Əhmədi-biqəm olması, tənbəllik etməsi, qəsdən özünü işə verməməsi onu təbdən çıxartmışdı.* Ə.Vəliyev. *Bu dəllalların içində Əhmədi-biqəmləri çoxdur.* P.Makulu.

**ƏHMƏQ** [*ər.*] b a x **axmaq**. *Əlhəq, münəccimbaşı dəxi, görünür ki, əhməq imiş.* M.F.Axundzadə. *Gücümü mən bilə-bilə nahaq; Şirə qıldım hücum, mən əhməq.* A.Səhhət. *Ağzını, az qaldı ki, dartıb cıraydım əhməqin! Yumruğumla qol-qabırğasın qıraydım əhməqin!* Ə.Nəzmi.

**ƏHMƏR** *sif.* [*ər.*] *klas.* Qırmızı. *Hanı o sən görən əhmər yanaqlar; Müsəlsəl keysular, nəsrin buxaqlar.* Q.Zakir. *Rəngi-ruyi qızılgüldən əhmərdir; Əl-ayağı, sanasan ki, mərmərdir.* Aşıq Ariz. *Bəzənirsiz al qumaşa; Əhmər, yaqut, yəmən, dağlar!* Aşıq Şəmşir.

◊ **Hilal əhmər** – b a x **hilal**.

**ƏHRAM** *is.* [*ər.*] 1. İndi piramida adlanan həndəsi cismin köhnə terminologiyadakı adı.

2. Qədim Misir fironlarının mumiyalanmış cənazələrinin saxlandığı, alt tərəfi dördbucaq şəklində, yuxarı qalxdıqca daralıb şişləşən, daşdan tikilmiş, çox nəhəng sərdabə.

**ƏHRAMVARİ** *sif.* Əhrama oxşayan, əhram şəkilli, getdikcə yuxarısı daralan.

**ƏHRİMƏN** *is.* [*fars.*] Zərdüşt dinində: şər allahı, şər və zülmət mənbəyi. // *məc.* Pis qüvvə, mənhus qüvvə, şər qüvvə. [Bəlli Əhməd:] *Paşa, Koroğlunu heç əhrimənlər tuta bilmir.* "Koroğlu". *Qoyma əğyar eyləsin kuyində cövlan, ey pəri; Əhrimənlər maliki-mülki-Süleyman olmasın!* M.Ə.Sabir. *Xeyr! Nə iblis var, nə də əhrimən; Əqlin övladıdır xeyir də, şər də.* S.Vurğun.

**ƏHSƏN** *nida* [*ər.*] 1. Bəyənmə, tərif bildirir – afərin! barakallah! eşq olsun! *Əhsən sənə, ey vətənin qəhrəman oğlu! Əhsən onu yaradan əllərə! Əhsən bu kəlama! – Hər ildə müsəlman edə gər bunca tərəqqi; Bir az keçər aləm deyər: – Əhsən, belə millət!* Ə.Qəmküsar. [Səfər bəy:] *Əhsən! Yaxşı sudur, Qənbərqulu!* B.Talıblı. *Kimsə yerindən dedi: – Bu ağıllı təklifdir. Əhsən bu kəlama..* Ə.Vəliyev. □ **Əhsən demək (oxumaq)** – tərifləmək, afərin demək, bəyənmək. *Hamı sənə əhsən deyər. – Gül rüxsarın əhsən deyib bülbülə; O çeşmi-xumarın yadıma düşdü.* "Abbas və Gülgəz". *O, tamaşa günü anasını aparıb zalda oturdacaqdı ki, baxıb oğlunun göstərdiyi məharətə əhsən desin.* S.Rəhman. *Ətri gözəl, təzə balın; Baxan kimi xoş dadına; Bir ağızdan əhsən dedi; Hamı onun ustadına.* M.Dilbazi.

2. Bəzən əks mənada işlənir. [Gəray:] *Əhdi, ilqarı nə tez qırdın sən? Adına bu yaraşarmı, əhsən!* A.Şaiq.

**ƏHVAL** *is.* [*ər.* "hal" söz. cəmi] 1. Kef, hal, ruhi vəziyyət. *Əhvalın necədir? – Bəli, dərd əhlinin əhvalını dərd əhli bilir; Kimsə bilməz ki, necə yardan oldum məyus.* S.Ə.Şirvani.

2. Keyfiyyət, vəziyyət, hal. *Güldükcə təbiət açılır min cürə güllər; Quşlar da bu əhvalı görüncə sevinirlər.* A.Səhhət. *İnmirə məhəlləsi bu əhvalı görüb dodaqaltı gülürdü.* N.Nərimanov. *Fəqət nədənsə o gün əhvalım tamamilə pərişan keçdi.* S.Hüseyn. // Səhhətcə vəziyyət. *Xəstənin əhvalı pisləşmişdir. – Bir gün Məmməd sövdəgər bazarda əhvalını pis görüb, haman saat dükanını bağlayıb evə gəldi.* “Aşıq Qərib”.

3. Keçinmək, dolanmaq vəziyyəti; güzəran. *İşə girəndən sonra əhvalı xeyli yaxşılaşmışdır.* // Var, dövlət, pul, tanqah. [Cavadın] *on min manata yaxın əhvalı var.* Ə.Haqverdiyev. *Bu gələn kişidə əhval olar?* S.Rəhimov. ◊ **Əhval sormaq (soruşmaq, tutmaq, bilmək)** – kefini, halını, vəziyyətini soruşmaq; əhvallaşmaq. [Qurban] [Səfərə] *yaxınlaşaraq əhval soruşdu.* A.Şaiq. *Nənəqız bu saat ağsaqqal kişiyə yanaşıb, yenə də ondan bir əhval tutmaq istədi.* S.Rəhimov. *Şəhərdən gələn adamları ziyarətdən qayıtmışlar kimi əhatə edir, əhval soruşurdular.* Mir Cəlal. **Əhvalı bulanmaq (qarışmaq, pozulmaq)** – 1) kefi pozulmaq, kədərlənmək, qəmginləşmək. *..Axşam yaxınlaşdıqca Həsən kişinin əhvalı bulanırdı.* M.İbrahimov; 2) xəstələnmək, xəstəliyi daha da ağırlaşmaq.

**ƏHVALAT** *is.* [*ər.*] Hadisə, olmuş iş, olub keçən işlər, qəziyyə. *Əhvalatı söylədi. Əhvalat vaqe olur.. Əhvalatdan xəbərin varmı? – Alı kişi əhvalatı oğluna danışdı.* “Koroğlu”. [Əhməd:] *..Əhvalat uzundur. Mən müxtəsər edirəm..* T.Ş.Simurq. [Səfərəli:] *Bura bax, əhvalat belədir.* H.Nəzərli.

**ƏHVALLAŞMA** “Əhvallaşmaq”dan *f.is.*

**ƏHVALLAŞMAQ** *qarş.* Bir-birinin əhvalını, kefini, halını soruşmaq; salamlaşmaq. *Onlar əhvallaşıb dərdləşdilər.* S.Rəhimov. *Ürəyin istəyən adam ilə danışmağa, əhvallaşmağa vaxt tapılar..* Mir Cəlal.

**ƏHVALLI** *sif. dan.* 1. Yaxşı xasiyyətli, xoşagələn, deyib-gülən, xoşsöhbət. *Əhvallı adam. Əhvallı kişidir.* – [Müdir:] *Amma əcəb də əhvallı zabit idi.* H.Nəzərli.

2. Varlı, dövlətli, tanqahlı. *Əhvallı adam.*

3. Yaşlı, hörmətli. *İllər boyu silahlarını yerə qoymayan bu əhvallı qocalar deyişə-deyişə burada işləmişlər.* S.Rəhimov.

**ƏHVALPÜRSAN** *is.* [*ər.* əhval və *fars.* ...pürsan] *köhn.*: **əhvalpürsan olmaq** – xəbər tutmaq, vəziyyəti öyrənmək. *..Zəlzələnin nəticəsindən əhvalpürsan olduq.* C.Məmmədquluzadə. *Hamısı əhvalpürsan olur. Fəramərz kişi əhvalatı söyləyir..* T.Ş.Simurq. [Niyaz] *bir az əhvalpürsan olduqdan sonra soruşdu.* Ə.Vəliyev.

**ƏHVALPÜRSANLIQ** *is. köhn.* Bir-birinin əhvalını soruşma, salamlaşıb əhvallaşma. *Elə bu yerdə Kərəmin bir neçə dostu əhvalpürsanlığa gəldilər.* “Əsli və Kərəm”. *Salamlaşdıqdan və əhval-pürsanlıqdan sonra bir guşəyə çəkilib əyləşdik.* Ə.Haqverdiyev. *Molla bacı gülümsünürdü, qızlara xeyir-dua verirdi və sonra əhvalpürsanlıq başlayırdı.* Çəmənzəminli. ☐ **Əhvalpürsanlıq etmək** – bir-birinin əhvalını soruşmaq, əhvallaşmaq. *Haman saat xan bir neçə mötəbər şəxsi oğlunun yanına göndərdi ki, ondan əhvalpürsanlıq etsinlər.* “Əsli və Kərəm”.

**ƏHVALİ-RUHİYYƏ** *is.* 1. Ruhi hal, ruhi vəziyyət. *Düşkün əhvali-ruhiyyə. – ..Fərdiyyətçilik və xüsusiyyətçilik əhvali-ruhiyyəsi ölməkdədir.* M.İbrahimov.

2. Bir şəxsin, ya kütlənin, cəmiyyətin fikri, hissiyyatı. *İctimaiyyətin əhvali-ruhiyyəsi. – Səlim onu çox yaxşı tanıyırdı. Onun əhvali-ruhiyyəsini tam üç ay idi ki, tədqiq edir.* S.Hüseyn.

**ƏHYA** *is.* [*ər.*] *klas.* 1. Diriltmə, canlandırma, oyatma; dirilmə, canlanma, oyanma. *Nola gər əmvatü əhya versə sübhün dəmləri; Zikri-ləlindir, kim eylər dəmbədəm təkrar sübh.* Füzuli.

2. *məc.* Yenidən həyat vermə, bərpa etmə, abadlaşdırıb şənləndirmə, canlandırma. ☐ **Əhya etmək** – yenidən həyat vermək, canlandırmaq, bərpa etmək, abadlaşdırıb şənləndirmək. *Biz behiştə bərabər olan vətənimizin şərafətini əhya etməliyik.* M.F.Axundzadə. // Vücuda gətirmə, təsis etmə.

3. *din.* Dindar müsəlmanların gecə sübhə kimi ibadətlə məşğul olması. *Əhya gecələri. – Orucluq ayının* [ramazanda] *19, 21, 23-cü günlərinə əhya axşamı və ya sadəcə əhya deyərdilər.* H.Sarabski. *Əhya gecəsi olduğu üçün, əsil möminlər .. başlarına Quran qoyub dua oxumaqla səhəri açmaq niyyətində idilər.* B.Talıblı.

**ƏHYANA** *bağl. dan.* Əgər, hərgah, işdir. *İşdi, əhyana birdən tutulsan, onda bir qurğu qurub Koroğlunu Bayazidə göndərəcəyəm.* "Koroğlu". [Səkinə xanım:] *..Sandıqlar içində aparıb, şahid-sübut ilə hakimi-şərə tapşırdı ki, əgər, əhyana, mən ölsəm, bu pulu sonra mənim hər kəs şəri varisim qalsa, ona rədd elə!* M.F.Axundzadə.

**ƏXBAR** *is.* [*ər.* "xəbər" söz. cəmi] 1. Xəbərlər, məlumat. *Çünki o məlumatların əxbarı əksər övqat nəticə bağışlayır, amma özləri yalançı və bədzatdırlar.* M.F.Axundzadə.

2. Keçmişdə bəzi dövraşırı mətbuatın adı.

**ƏXƏVİ** *is.* [*ər.*] *köhn.* Qardaş. [Mirhaşım:] *Hamınıza məlumdur ki, bəndənin kiçik əxəvisi banki-şahənşahidə qulluq edir.* P.Makulu.

**ƏXƏVİZADƏ** *is.* [*ər.*] *köhn.* Qardaşoğlu.

**ƏXİ** *is.* [*ər.*] *klas.* 1. Qardaş.

2. *tar.* Cəm şəklində: **əxilər** – orta əsrlərdə Kiçik Asiyada və qismən Azərbaycanda meydana gəlmiş "Zəhmət qardaşlığı" deyilən cəmiyyətin üzvləri. [Qoca:] *Əxilər məclisində mən səninlə bir süfrədə çörək kəsmişik, bala!* Ə.Məmmədxanlı.

**ƏXLAQ** *is.* [*ər.*] 1. İnsanın mənəvi keyfiyyətini, əhvali-ruhiyyəsini müəyyən edən etik normalar; mənəviyyat. *Mən .. müsəlman xalqlarının əxlaq və rəftarını yaxşılaşdırmaq məqsədi ilə bir neçə səhnə əsəri yazmışam.* M.F.Axundzadə. *Əxlaqı pozğun, adəti pis, pasibanı yox; Qəlbim yanar ona, deyərəm: "Ay yazıq çocuq!"* A.Səhhət. *Nizamülmülkün yazdığı siyasətnamə – tarix, Nizaminin nəzmə çəkdiyi siyasətnaməsi isə bir əxlaq dərsidir.* M.S.Ordubadi.

2. İnsanın yaşadığı cəmiyyət və onu təşkil edən üzvləri ilə rəftarı və özünü aparma qaydası. *Əxlaq normaları. – Mehriban açıqdan-açığa görürdü ki, Səlim əxlaq və təbiətcə ətrafında gəzib dolaşan, evinə qonaq gələn adamların heç birinə bənzəməyir.* S.Hüseyn. *İnsanın qiyməti onun qabiliyyəti və əxlaqı ilə ölçülür.* Ə.Sadıq. *Gözəl əxlaqı, pak və səmimi ürəyi, həddən artıq zirəkliyi və qabiliyyəti Budağı müəllimlərə və həm də yoldaşlarına çox sevdirdi.* Ə.Vəliyev.

**ƏXLAQİ** *sif.* [*ər.*] Əxlaqa aid olan. *Əxlaqi nəticələr. Əxlaqi prinsiplər. Məsələnin əxlaqi cəhəti. – Əxlaqi əsasları çürük olan bir cəmiyyətdə ədalət və haqqa söykənən qanun təsəvvür etmək çətindir.* M.İbrahimov.

**ƏXLAQİYYAT** *is.* [*ər.*] *köhn.* Əxlaq elmi; əxlaqdan bəhs edən elm.

**ƏXLAQLI** *sif.* Əxlaqı çox yaxşı olan, əxlaq normalarına ciddi riayət edən; iffətli, ismətli, tərbiyəli. *Əxlaqlı uşaq.*

**ƏXLAQLILIQ** *is.* Əxlaqlı adamın hal və sifəti; iffətlilik, ismətlilik.

**ƏXLAQSIZ** *sif.* 1. Əxlaqı pis, mənəvi cəhətdən pozğun. *Əxlaqsız adam.* – [Yaşlı kişi:] *Burada bir gecədə neçə zəvvara siğə olan əxlaqsız qadınların olduğunu bilirdim.* S.Hüseyn. *Komediyanın baş qəhrəmanı Şeyx Nəsrullah həyasız, yalançı və əxlaqsız bir adamdır.* M.İbrahimov.

2. Əxlaq normalarına zidd; ədəbsiz, tərbiyəsiz. *Əxlaqsız hərəkət. – Səni sevdiyim üçün mənə əxlaqsız deməyin nəzakətsizlikdir.* M.S.Ordubadi.

**ƏXLAQSIZCA(SINA)** *zərf* Əxlaq normalarına zidd olaraq; ədəbsizcəsinə. *Əxlaqsızcasına hərəkət etmək.*

**ƏXLAQSIZLIQ** *is.* 1. Əxlaq pozğunluğu, mənəviyyat pozğunluğu, əxlaq pisliyi; əxlaqsız adamın hal və sifəti. *İndi Zeynal belə düşünürdü ki, onun hörmət və nüfuzunun azalması və xidmətlərinin əlindən çıxması Mehribanın əxlaqsızlığından irəli gəlmişdir.* S.Hüseyn.

2. Əxlaqsız hərəkət. *Əxlaqsızlıq etmək. – Əxlaqsızlığın dəhşətamiz və çılpaq səhnələri açıldı.* M.İbrahimov.

**ƏXTƏR** *is.* [*fars.*] *şair.* 1. Ulduz. *Ulduzlar içində gözümə dəydi bir əxtər; Məftun olaraq sevdim onu, heyrətə daldım.* A.Şaiq.

2. *məc.* Bəxt, tale, bəxt ulduzu.

**ƏXZ** *is.* [*ər.*] Alma, götürmə; alıb mənimsəmə. □ **Əxz etmək** – almaq, götürmək, alıb mənimsəmək. *Elm əxz etmək. – Əkdiyin dənənin budur səməri; Səndən əxz eləyib həmin hünəri.* M.Ə.Sabir. [Əbdüləli bəy:] *Xaricilər də hələ mədəniyyəti birdən əxz eləmişlər.* C.Cabbarlı. **Əxz olunmaq** – götürülmək, alınmaq. *Mənim qanacağıma görə, sizin kitabınızda olan məlumat mənə Avropa və Rusiya mənbəyindən əxz olunmuşdur.* C.Məmmədquluzadə.

**ƏJDAHA** *is.* [*fars.*] 1. Ağzından od püskürən, insan və heyvanları udan, qanadlı nəhəng, ya ilan şəklində təsəvvür olunan mövhum bir heyvan. *Yeddibaşlı əjdaha* (nağıllarda). – [Nağılların qəhrəmanları] *divlərlə, əjdahalarla pəncə-pəncəyə gəlib vuruşar, hər cür çətin şeyə qalib gələrdilər.* M.Rzaquluzadə. ☐ **Əjdaha kimi**... – təşbeh məqamında. *Saat on iki tamamda buxar arabası acıqlı əjdaha kimi Balaxanı tərəfdən gözlərini ağardaraq nərə vurmağa başladı.* S.M.Qənizadə. [Həmzə:] *Üç nəfər əjdaha kimi oğlum var.* C.Cabbarlı.

2. *məc.* Çox qüvvətli, iri, heybətli, qorxmaq bilməyən adam haqqında; pəhləvan. *O, lap əjdahadır.* – [Aslan bəy:] ..*Əjdahadır, əjdaha. Bu saatda tərəzinin bir gözünə 15 öküz qoysalar, Tarverdini verməərəm..* C.Cabbarlı. *Səmədin gözünə əvvəl əjdaha kimi görünən Nadir, indi bu cür sadə və yumşaq danışıqdan sonra bütün əzəmət və məhəbbətini itirdi.* B.Talıblı. [Mirzə Cəmil:] *Ataşı Kəngərli kimi əjdahaya tuş elədim.* Ə.Vəliyev.

◊ **Əjdaha bürcü** *astr.* – Böyük Ayı bürcü ilə Kiçik Ayı bürcü arasında, göyün şimal yarımkürəsində olan bürc.

**ƏJDƏR** [*fars.*] b a x **əjdaha**. [İsmət:] *Gerçəkdən pək gözəl, pək süslü xəncər; Bir parçacıq polad, lakin bir əjdər..* H.Cavid. *Lakin əjdər olur suda hər yosun; Səni əjdahalar istəyir udsun.* O.Sarıvəlli.

**ƏKDİRİLMƏ** "Əkdirilmək"dən *f.is.*

**ƏKDİRİLMƏK** "Əkdirmək"dən *məch. Bağda çoxlu ağac əkdirilmişdir.*

**ƏKDİRMƏ** "Əkdirmək"dən *f.is.*

**ƏKDİRMƏK**[1] *icb.* Əkmə işi gördürmək, basdırtmaq. *Boş yerlərdə ağac əkdirmək.* – [Hacı Nuru şair:] [Səfər bəy], *mülkədarsan, sənə lazım idi ki, əkdirəydin, biçdirəydin, dövlət qazanaydın...* M.F.Axundzadə. *Tikinti rəisi hələ yazda Qubadan və başqa rayonlardan xeyli ağac tingləri gətirdib küçələrə əkdirmişdi.* Ə.Sadıq. // Tumu şumlanmış yerə səpdirib üstünü torpaqla örtdürmək. *Əkin əkdirmək.*

**ƏKDİRMƏK**[2] *icb.* Başqası vasitəsilə ötürmək, başdan eləmək.

**ƏKDİRTMƏ** "Əkdirtmək"dən *f.is.*

**ƏKDİRTMƏK** b a x **əkdirmək**[1]. *Yerləri əkdirtmək.*

**ƏKƏ** *sif.* Böyük, iri, yekə; əkəc. *Əkə adam. Əkə kəl.* – *Əzizim, əkə dərdim; Yükləyib ləkə dərdim.* (Bayatı).

**ƏKƏ-BİKƏ** *sif. dan.* Yaşlı, təcrübəli, həyat təcrübəsi olan; dünyagörmüş. *Əkə-bikə qadın.* – [Xumar:] *Eh, bilirəm, əkə-bikə arvadlar kimi yenə başlayacaqsan məni danlamağa*: – *Niyə belə durdun, niyə belə oturdun.* İ.Şıxlı.

**ƏKƏC** *sif.* və *is.* Böyük, yekə, iri; yaşlı, təcrübəli. ..*İldırım İldırımzadə iclasda özünü bir əkəc kimi aparırdı.* S.Rəhimov.

**ƏKƏC-ƏKƏC** *zərf* Əkəc kimi, böyük, yaşlı, təcrübəli adam kimi. *Əkəc-əkəc danışmaq.* – *Məktəbdə şagirdlərin ümumi yığıncağı olduğu zaman* [Aslan] *əkəc-əkəc qabağa çıxır, öz sinif yoldaşlarını tərif edirdi.* S.Rəhimov.

**ƏKƏCLƏNMƏ** "Əkəclənmək"dən *f.is.*

**ƏKƏCLƏNMƏK** *f.* Yekələnmək, irilənmək, təcrübələnmək, təcrübə qazanmaq.

**ƏKƏCLİK** *is.* Böyüklük, yekəlik, irilik; təcrübəlilik.

**ƏKƏLİK** *is.* Böyüklük, irilik, yekəlik, əkəclik.

**ƏKƏLƏNMƏ** "Əkələnmək"dən *f.is.*

**ƏKƏLƏNMƏK** b a x **əkəclənmək**.

**ƏKƏNƏCƏK** b a x **əkənək**.

**ƏKƏNƏK** *is.* Taxıl əkilmiş yer, əkin yeri. *Xalqın ümidi artdı hasil üçün; Əkənəklərdə nəfi-kamil üçün.* A.Səhhət.

**ƏKƏNƏK-BİÇƏNƏK** b a x **əkin-biçin**.

**ƏKİB-BECƏRMƏ** "Əkib-becərmək"dən *f.is.*

**ƏKİB-BECƏRMƏK** *f.* Əkib və qulluq edib böyütmək, becərmək, yetişdirmək. ..*Ağacların çoxunu* [Piri kişi] *özü öz əli ilə əkib-becərmişdi.* S.S.Axundov. *Siz indi gərək elə həvəslə çalışıb, torpağı elə əkib-becərəsiniz ki, qışda heç nədən korluq çəkməyək.* İ.Şıxlı.

**ƏKİB-BİÇMƏ** "Əkib-biçmək"dən *f.is.*

**ƏKİB-BİÇMƏK** *f.* Əkinçiliklə, biçinçiliklə, yaxud tərəvəzçiliklə məşğul olmaq. *Səfər kişi .. göy-göyərti əkib-biçir.* Mir Cəlal. [Dilavər:] *Hələ qoy işlərimizi sahmana salaq, taxılımızı əkib-biçək, sonrası qiyamət olacaq.* İ.Şıxlı.

**ƏKİLİ** *sif.* Əkilmiş. *Bütün bu yerlər əkilidir.*

**ƏKİLİB-BECƏRİLMƏ** "Əkilib-becərilmək"dən *f.is.*

**ƏKİLİB-BECƏRİLMƏK** *məch.* Əkilib və qulluq edilib böyüdülmək, yetişdirilmək, becərilmək.

**ƏKİLİB-BİÇİLMƏ** "Əkilib-biçilmək"-dən *f.is.*

**ƏKİLİB-BİÇİLMƏK** *məch.* Əkilmək, becərilib məhsul götürülmək.

**ƏKİLİŞ** *is.* Əkmək işi. *Taxıl əkilişi.*

**ƏKİLMƏ¹** "Əkilmək¹"dən *f.is.*

**ƏKİLMƏ²** "Əkilmək²"dən *f.is.*

**ƏKİLMƏK¹** *f.* Hiss etdirmədən çıxıb getmək, gözdən itmək, qaçmaq. *Quşlar uçdu, əkildi; Vay, səsləri kəsildi.* A.Səhhət. *Kərbəlayı Vəli və Hacı Baxşəli bir-birinə acıqlı baxa-baxa çıxırlar. Camaat yavaş-yavaş əkilir.* C.Məmmədquluzadə. *Zalım balaları fikrimizi duydular, durub əkildilər.* Qantəmir.

**ƏKİLMƏK²** "Əkmək¹"dən *məch. Ağac əkilmək. Bütün düz yerlər indi əkilir. Burada buğda əkilmişdir. – Bağban, mənə bar gətir; Əsirgəmə, var gətir; Əkilməmiş ağacdan; Dərilməmiş nar gətir.* (Bayatı).

**ƏKİLMİŞ** *f.sif.* Sürülərək toxum səpilmiş, yaxud ağac, kol basdırılmış. *..Xudayar bəy zəmilərə cüt göndərib başladı sürdürməyi. Əkilmiş zəmiləri özü öz malı kimi biçirdi..* C.Məmmədquluzadə.

**ƏKİMLİ** *sif.* Əkilmək üçün yararlı, əlverişli, bərəkətli, münbit. *Əkimli yer.*

**ƏKİN** *is.* 1. Taxıl, bostan məhsulları və s. əkilmiş yer; zəmi. *Əkinlərdə taxıl təzəcə göyərməkdədir. – Bağın, əkinin xeyrini bəylər görəcəkmiş; Toxum əkməyə dehqanları neylərdin, ilahi?!* M.Ə.Sabir. *Bu əhvalatdan üç gün sonra Qulunun əkin yerində qızğın iş gedir, sürətlə buruq qurulurdu.* A.Şaiq. // Tarlada, zəmidə bitmiş taxıl, dənli bitkilər və s. *Yazlıq əkin. Payızlıq əkin. Əkin yeri. – Əkməsən, əkin olmaz.* (Ata. sözü). *..Qonşunun əkinini otardanlar manifestə düşür, düşmənin tayasına od vuranlar manifestə düşür.* C.Məmmədquluzadə. *İndi məhsulun müqəddəratı əkini vaxtlı-vaxtında suvarmaqdan asılı idi.* Ə.Sadıq.

2. Əkmə, əkmək işi. *Əkin vaxtı. – Nə zaman ki arabalar köç yoluna düzülür; Kəndli yoldaş əkinindən, biçinindən üzülür.* S.Vurğun. *Rüstəm kişi yanakı oturub balaca stola dirsəkləndi və yaz əkininə hazırlıq haqqında məlumat verdi..* M.İbrahimov.

3. Bəzi ot adları ilə birlikdə işlədilərək, onların əsasən zəmidə, əkin arasında bitdiyini göstərir; məs.: əkin qərənfili, əkin laləsi. – *Əkin qarğasoğanı .. gövdəsi 80 sm-ə qədər hündürlüyündə çoxillik bitkidir.* H.Qədirov. *Tüklü qərənfil və ya əkin qərənfili taxıllar arasında bitən alaq otudur, toxumları zəhərlidir.* M.Qasımov.

**ƏKİNALTI: əkinaltı qat** – əkilən torpağın əkin altında qalan qatı, layı, təbəqəsi.

**ƏKİN-BİÇİN** *is.* Əkinçilik; əkinçilik işi, tarlaçılıq. *Əkin-biçin vaxtı. Əkin-biçin başlandı. – İskəndər səbir edib yarım ilə qədər gözlədi. Canına qulluq eləyib əkinə-biçinə getdi.* M.Hüseyn. *Qafar .. kəndə gedər, əkini-biçini yığışdırmaq üçün atasına kömək edərdi.* Ə.Əbülhəsən.

**ƏKİNÇİ** *is.* Əkin əkib biçməklə (əkinçiliklə) məşğul olan adam; cütçü. *Əkinçi yağış istər, yolçu quraqlıq.* (Ata. sözü). *Bir əkinçi gedirdi məstanə; Yolda ol rast gəldi bir xanə.* S.Ə.Şirvani. *Fərmanın atası Qara kişi yaxşı əkinçi olmaqla bərabər, mahir bir dülgər idi.* Ə.Sadıq.

**ƏKİNÇİLİK** *is.* 1. Əkin əkib biçmə işi; ziraət. *Qabaqcıl əkinçilik üsulları.* – [Bəxtiyarın] .. *kəndin yeni təşkil edilən əkinçilik maşınları şirkətinə üzv olmaqla çöldə bir qədər dəmyə əkini vardı.* S.Hüseyn. *Bakının ətrafında otuz səkkiz kənd vardı. Bu kəndlərin hamısı əkinçilik, bağçılıq və qoyunçuluqla məşğul olardı.* H.Sarabski. // Kənd təsərrüfatı bitkiləri yetişdirmək haqqında elm.

2. Əkinçinin işi, peşəsi. *Onun sənəti əkinçilikdir.*

**ƏKİNƏBAXAN** *is.* Əkin qoruqçusu.

**ƏKİNƏCƏK** b a x **əkənək**.

**ƏKİN-ƏKİNƏCƏK** b a x **əkin** 1-ci mənada. [Birinci kəndli:] *Doğrusu, əkin-əkinəcəyimiz yanırdı, camaatdan üç-dörd vəkil seçib göndərdik mirabın yanına.* Ə.Haqverdiyev.

**ƏKİNQABAĞI** *sif.* Əkməkdən qabaq olan, səpinə hazırlıqla əlaqədar olan. *Torpağın əkinqabağı suvarılması. Əkinqabağı becərmə.*

**ƏKİNLİK** *is.* Əkin yeri, taxıl yeri. *Kənddən azca o yanda əkinliklər var.*

**ƏKİN-SƏPİN** *is.* Taxıl əkmə işləri. *Əkin-səpin üçün qarşıda çox az vaxt qalırdı.* İ.Şıxlı.

**ƏKİN-TİKİN** *top. dan.* Əkin, əkin yeri; həyətyanı təsərrüfat. *Onun əkin-tikini vardır. – Əkinə-tikinə, ya şəhərə gedən sübhdən gedib.* Mir Cəlal.

**ƏKİŞ** *is.* Əkmə işi və tərzi.

**ƏKİZ** 1. *sif.* Anadan cüt olan, cüt doğulan. *Əkiz uşaqlar. Əkiz* (z.) *doğmaq. – Çobanlar bəzən qucaqlarındakı əkiz quzunu soyuqdan qorumaq üçün ərklə Səfər kişinin mənzilinə girirlər.* Mir Cəlal.

2. *is.* Əkiz doğulmuş uşaqlardan hər biri. *Əkizlərin biri oğlan, digəri qızdır. // məc. zərf* Bərabər, eyni zamanda. *Əkiz yaranmışdır insan ilə qəm.* S.Vurğun. *..Fəqət əkiz yaranmışdır xəyal, həqiqət.* M.Rahim. *Bizlə əkiz doğulmuşdur; Namus, vicdan, şərəf, hünər.* O.Sarıvəlli.

**ƏKİZLİK** *is.* Əkiz olma halı. *Əkizlik iki adamın bir-birinə oxşamasını tələb etmir.*

**ƏKİZTAY(I)** bax **əkiz** 2-ci mənada. [Pəri nənə:] [Hümmətin] *bir böyük külfəti vardı. Südəcər, əkiztay, cin çolpası kimi zılğa-zılğa bir-birinə qarışmışdı.* S.Rəhimov.

**ƏKİZTAYLI** bax **əkiztay(ı)**. *Hündür, alçaq deyil, orta boyludur; Deyəsən, mənimlə əkiztaylıdır.* Molla Cümə.

**ƏKKAS** *is.* [*ər.*] *köhn.* Fotoqrafın köhnə adı.

**ƏKKASXANA** *is.* [*ər.* əkkas və *fars.* ...xanə] *köhn.* Fotoqrafiyanın köhnə adı.

**ƏKLİL** *is.* [*ər.*] Çiçəklərdən və ya yarpaqlardan dairə və ya tac şəklində hörülmüş bəzək; çələng. *Canlı çiçəklərdən düzəldilmiş əklil. – İrəlidə Azərbaycan aktyorları əklil aparır, bunların ardınca teatrın Şərq orkestri matəm marşı çalırdı.* C.Cabbarlı. *Səadət əklili ona töhfədir..* M.Rahim. *Qar altında yaz gözləyən əkin kimi; Ədalətə heykəl yonsan, əklil kimi*. M.Araz.

**ƏKMƏ** 1. "Əkmək[1]"dən *f.is. Şitil əkmə.*

2. *sif.* Əkilmiş, əkilən. *Əkmə ot.*

**ƏKMƏK[1]** *f.* 1. Sürülmüş yerə toxum atmaq, toxum səpmək. *Nə əkərsən, onu biçərsən.* (Ata. sözü). [Əyyar:] *Onlar səndən də güclüdür; Əkin əkir, naxır güdür..* A.Şaiq. [Haşım] *əkirdi, biçirdi və hər bir ağır zəhmətlərə qatlaşırdı.* B.Talıblı.

2. Quyu şəklində qazılmış yerə ağac, kol və s. basdırmaq. *Ağac əkmək. – Bir gün əkdim miyanə; Gül sünbülə dayana; Oxu, bülbülüm, oxu; Bəlkə yarım oyana.* (Bayatı). *Bu gün əkdiyimiz bu qatar-qatar; Ağaclar bir zaman orman olacaq.* S.Vurğun. *Şair ilə Afaq .. ləklərə çiçək, yonca toxumu səpib çəpər boyu cavan ağaclar əkdilər.* Ə.Məmmədxanlı.

3. *məc.* Başlanğıcını qoymaq, binasını qoymaq. *İllər keçib, zamanələr dolanıb, o şəxslərin əkdikləri toxumlar bar verib.* Ə.Haqverdiyev.

4. *məc. dan.* Döl qoymaq, törətmək. *Goruna od qalansın, ay bu sarsaq kişini əkən dədə!* "M.N.lətif.".

**ƏKMƏK[2]** *is.* Çörək. [Üçüncü satıcı:] *Qızarmış təzə əkmək, təzə qaymaq; Çapuq gəl, durma gəl, fürsətdir ancaq.* H.Cavid. *Qaldı əynimdə əski bir köynək; Tapmadım gündə bir yavan əkmək.* M.S.Ordubadi. *Əkməyi çox, dərdi yox; Sən niyə geydin qara?* Ə.Nəzmi.

**ƏKMƏK[3]** *f.* Hiylə və tədbirlə yola salmaq, yanından uzaqlaşdırmaq, rədd etmək, başdan eləmək. *Hərif qonağını, deyəsən, əkdi. – Bəyin fikrinə gəldi ki, aşnam məni əkmək istəyir.* Mir Cəlal. *O: – Evə get, – deyə, Nuşunu əkdikdən sonra Əhmədin qabağına çıxdı.* Ə.Əbülhəsən.

**ƏKNAF** *is.* [*ər.*] *köhn.* Ətraf, tərəf, cəhət, ətrafdakı yerlər. *Çox çəkmədi ki, ətraf və əknafda aclıq başladı.* S.S.Axundov.

**ƏKRƏM** *sif.* [*ər.*] *klas.* Kəramətli, comərd, alicənab.

**ƏKS** [*ər.*] 1. *is.* Bir şeyin işıq şüalarının sınması nəticəsində hamar, parlaq səth, güzgü, su və s. üzərində görünən şəkli, surəti. *Aynada öz əksini görmək. Suda öz əksini görmək. Dəniz üzərində ulduzların əksi görünürdü. Mağazanın qabağından keçənlər aynalı vitrinlərdə öz əkslərini görürdülər.* □ **Əks etmək** – hamar və parlaq səth üzərində inikas etmək. *Qüruba doğru enən günün şüaları suya əks edərək qəribə rənglərə çalırdı.* M.Hüseyn. // *məc.* İnikas, güzgü. *Batinin əksidir fəqət zahir.* H.Cavid.

2. *is.* Səsin bir yerə dəyib geri dönməsi. *Elə dərələr vardır ki, bir səs çıxaranda dörd*

*əks alırsan. – Mübarəkbad sədası xalqdan asimanə büländ oldu və barigahın imarətlərindən əksi təkrar tapdı.* M.F.Axundzadə. ☐ **Əks etmək** – 1) qaytarmaq. *Çıxır dağ döşünə körpə quzular; Tərlanın səsini əks edir sular.* S.Vurğun; 2) yayılmaq. *Ənisənin şöhrəti yavaş-yavaş öz oxuduğu məktəbin divarlarından dışarı çıxaraq başqa məktəblərə də əks etmişdi.* S.Hüseyn.

3. *is.* Şəkil, fotoşəkil. *Sitarənin xəyalında bir cavan oğlanın əksi nəqş bağlamışdı.* Çəmənzəminli. ☐ **Əksini almaq** *dan.* – fotoşəklini çəkmək.

4. *sif.* Tərs, inad, höcət. *Çox əks adamdır, dediyindən əl çəkmir.*

5. *sif.* Zidd, tərs. *Bunun tam əksi. Yalan doğrunun əksidir. Əks fikir. Əks nəticə. Əks mənada başa düşmək. Əks istiqamət.* – [Şeyx Nəim:] *Batinin əksidir fəqət zahir.* H.Cavid. [Şəmsiyyə:] *Bunun əksini iddia edən bir qadına inanma, xalaoğlu!* M.İbrahimov.

◊ **Əks etdirmək** – əyani surətdə göstərmək, ifadə etmək. *Dövrümüzü əks etdirən əsərlər, filmlər. Vəziyyəti olduğu kimi əks etdirmək. Əsər həqiqi mənzərəni yaxşı əks etdirir. – Cabbarlı günlərlə igid Babəkin xəyalı ilə yaşamış, bu böyük şəxsiyyətin surətini bədii bir əsərdə əks etdirmək fikrinə düşmüşdü.* M.Arif. *Xalq mahnıları xalqın ta qədim zamanlardan bu günə qədər olan tarixini bədii surətdə əks etdirir.* Ə.Bədəlbəyli. **Əks olunmaq** – əyani surətdə göstərilmək, ifadə edilmək. *"Muğan" dastanımda əks olunmadı; O yerdə gördüyüm gözəl bir səhnə.* S.Vurğun. *Bəzi mühərrirlərin xırda burjua mütərəddidliyi, ictimai hadisələrin anlayışdakı məhdudluğu jurnalın səhifələrində əks olunmaya bilməzdi.* M.İbrahimov. **Əks təqdirdə (surətdə)** – nəzərdə tutulduğu, deyildiyi, göstərildiyi kimi edilmədikdə, onun əksinə, ziddinə olsa, əgər belə olmasa, ayrı cür olsa, əksinə hərəkət edilsə, yoxsa. *Bir az gözləyin, əks təqdirdə mən sizinlə gedə bilməyəcəyəm.* – [Müəllim] *axırda belə dedi*: – *Əks surətdə rəftarım tamamilə başqa cür olacaqdır.* C.Cəbrayılbəyli. **(Öz) əksini tapmaq** – b a x **əks olunmaq**.

**ƏKS-CƏRƏYAN** *is.* [*ər.*] *xüs.* Cərəyanın əksinə olan cərəyan.

**ƏKSETDİRİCİ** 1. *is. xüs.* İşıq və ya istilik şüalarını, elektromaqnit dalğalarını əks etdirmək üçün cihaz. *Avtomatın fənərinin əksetdiricisi.*

2. *sif.* Əks etdirən, əks etdirmək üçün olan. *Əksetdirici alət. Əksetdirici aynalar.*

**ƏKSETMƏ** *is. xüs.* Səs, işıq və s.-nin bir yerə dəyib geri qayıtması; inikas.

**ƏKS-ƏMƏL** *is.* [*ər.*] *xüs.* Görülən işin əksi, ziddi.

**ƏKSƏR** *sif.* [*ər.*] Ən çox, lap çox, həddən ziyadə, ümumiyyətlə. *Əksər hallarda* (*çox hallarda*). – *Gərçi var iş qanan kişi tək-tək; Əksəri-xalq əvamdır, bişək.* S.Ə.Şirvani. *Əksər ovqat avam yaxşıya deyir pis, pisə deyir yaxşı.* C.Məmmədquluzadə. // Təsirlik halda: **əksəri** – çoxu, çoxusu, əksəriyyəti. *Camaatın əksəri. Tələbələrin əksəri yaxşı oxuyur. – Bu gün kəndlilərin əksəri işə çıxmamışdı.* T.Ş.Simurq. *Dağların hərəsi bir rəng çalır, çünki bunların eləsi var ki, meşələrlə örtülüblər, amma dağların əksəri lütdürlər.* C.Məmmədquluzadə. [Sultan:] *..Tiflisdə və qeyri yerlərdə oxumuş qızların əksəri məişətə və zindəganlığa bu təhər baxırlar.* N.Nərimanov.

**ƏKSƏRƏN** *zərf* [*ər.*] Çox vaxt, çox zaman, çox hallarda. *Əksərən onu axşamlar görmək olur. – Cəmilə Arzu qızı əksərən atasının öhdəsinə buraxırdı.* S.Rəhimov. // Əksəriyyəti, çoxu. *Əksərən uzunboğaz çəkmə, qalife şalvar və cibli köynək geyərək belini qayışla bərkitmiş kişilər furqonun yan tərəfinə doluşmuş*(*du*). M.İbrahimov.

**ƏKSƏRİYYƏT** *is.* [*ər.*] Çoxluq, ən böyük hissə. *Böyük əksəriyyət. Camaatın əksəriyyəti. Əksəriyyət etibarilə. Adamların əksəriyyəti bu cür geyinir. Səsvermədə əksəriyyət iştirak edirdi.* – [M.Qorkinin] *əsərlərinin əksəriyyəti isə elə bir həyat materialıdır ki, onları dəfələrlə oxuyur, hər oxuduqca yeni cəhətlər kəşf edirsən.* R.Rza. *Əksəriyyəti təşkil edən yerli ziyalılar da sevinirdilər.* Mir Cəlal. // Səs çoxluğu. *Təklif əksəriyyətlə* (z.) *qəbul olundu.*

**ƏKS-HƏMLƏ** [*ər.*] b a x **əks-hücum**.

**ƏKS-HÜCUM** *is.* [*ər.*] *hərb.* Hücuma qarşı olan hücum, hücum edən düşmənə qarşı hücum. *Ani əks-hücum. Əks-hücuma keç-*

*mək. Düşmənin əks-hücumu nəticəsiz qaldı. – Bölük əks-hücuma keçdi.* İ.Əfəndiyev. *Hə, Tapdıq, bu da əks-hücuma keçməyimiz üçün əmr! – deyə Mədətov yerindən sıçrayaraq ayağa qalxdı.* Ə.Əbülhəsən.

**ƏKS-İDDİA** *is.* [*ər.*] *hüq.* İddiaya qarşı irəli sürülən iddia.

**ƏKSİK** b a x **əskik**. *Əksik olmaz Koroğlunun qovğası; Düşər paşalarla cəngi, davası.* "Koroğlu". *Şirvanda olan handa bir əksik gözəlin; Bir qəmzəsi yüz huriyü qılmanə dəyər.* S.Ə.Şirvani.

**ƏKSİNƏ** *zərf.* 1. Tərsinə, ziddinə. *Əksinə hərəkət etmək. Bəzən əksinə olur. – ..Gün dağlara düşəndə, günün şəfəqi dağların gah bu tərəfini şölələndirib o tərəfinə qara kölgə salır, gah da əksinə.* C.Məmmədquluzadə. *Vəziyyəti büsbütün əksinə məna edirsiniz.* M.S.Ordubadi. □ **Əksinə getmək** – ziddinə getmək (hərəkət etmək), düşmənçilik etmək. *Zavallı anacığım!.. Tamam da sənin əksinə gedir.* S.S.Axundov.

2. Deyilənin və ya nəzərdə tutulanın, gözlənilənin və s.-nin tam tərsinə; biləks (bəzən "olaraq" sözü ilə). *Qüvvələrimiz nəinki azalmadı, əksinə, daha da artdı. Maşının sürətini azaltmaqdansa, əksinə, daha da artırdı. – Əksinə, Zeynəb qarı çox qoçaq bir qadın idi...* S.S.Axundov. *Əksinə, rəiyyətin "əlaltı və nankor" hərəkəti şeytan-şuğulun pıçıltısı ilə bəyin qulağına çatdı..* S.Rəhimov. *Tofiq isə əksinə, alçaq boylu sarışın, girdəsifət, ətli-canlı idi.* M.Rzaquluzadə.

**ƏKSİNQİLAB** *is.* [*ər.*] Öz hakimiyyətlərini saxlamaq, inqilabdan əvvəlki üsul və qaydaları bərpa etmək üçün istismarçı siniflərin inqilaba qarşı mübarizəsi. *Əksinqilabla mübariz. Əksinqilab qüvvələrini darmadağın etmək.*

**ƏKSİNQİLABÇI** 1. *sif.* Əksinqilaba xidmət edən, əksinqilab tərəfdarı. *Əksinqilabçı partiyalar. Əksinqilabçı dəstələr. Əksinqilabçı təşkilatlar.*

2. *is.* Əksinqilabda iştirak edən, əksinqilaba tərəfdar olan adam, əksinqilab iştirakçısı. *Siyahını yazan məşhur əksinqilabçı çar konsulxanası casuslarından Hacı Mirməhəmməd idi.* M.S.Ordubadi.

**ƏKSİNQİLABÇILIQ** *is.* Əksinqilabçı mahiyyətdə olma, əksinqilaba xidmət etmə.

**ƏKSİNQİLABİ** *sif.* İnqilab əleyhinə yönəldilmiş, ona zidd, düşmən olan; əksinqilabçı. *Əksinqilabi çıxışlar. Əksinqilabi cinayət. Əksinqilabi qiyam hazırlamaq.*

**ƏKS-İSTİQAMƏT** *is.* [*ər.*] *xüs.* Hər hansı bir istiqamətin əksi, ziddi. *Əks-istiqamətdə hərəkət etmək. Əks-istiqamətə yönəltmək.*

**ƏKS-KƏŞFİYYAT** *is.* [*ər.*] Düşmən agenturasına qarşı durmaq, casusluq, təxribatçılıq və s. ilə mübarizə aparmaq üçün təşkilat. *..Alman və osmanlı əks-kəşfiyyatı da ciddi surətdə işləyir və Cənubi Azərbaycanın hər tərəfində hörümçək kimi öz torunu hörürdü.* M.S.Ordubadi.

**ƏKS-KƏŞFİYYATÇI** *is.* Düşmən agenturasına qarşı mübarizə aparan kəşfiyyatçı.

**ƏKSLİK** *is.* 1. Əks şeyin halı.

2. Ziddiyyət, uyğunsuzluq, məntiqsizlik. *Fikirlər arasında əkslik.*

3. *fəls.* Aralarında ziddiyyət olan əşya, hadisə, ya proseslərdən hər biri. *Əksliklərin vəhdəti və mübarizəsi. İnkişaf əksliklərin mübarizəsidir.*

**ƏKS-MANEVR** *is.* [*ər.* əks və *fr.* maneoeuvre] *hərb.* Düşmənin manevrinə qarşı manevr.

**ƏKS-SƏDA** *is.* [*ər.*] 1. Qayalara, bina tağlarına və s.-yə toxunandan sonra təkrar qayıdan və eşidilən səs. *Musiqinin əks-sədası. Uğultunun əks-sədası. – Dağa dersəm, eşidir, sonra verir əks-səda; Daşa dönmüşlərə əks eyləmədi fəryadım.* M.Hadi. *Fəqət qamışlıqdan gələn əks-sədadan başqa bir səs eşitmədi.* H.Nəzərli. [At] *nə isə görüb bərkdən kişnəyir. Lakin bu kişnəmə heç bir əks-səda vermir.* R.Rza. // *məc.* Səs, əks. *Hadisələrin əks-sədası. – "Nicati-İran" qəzeti .. işlərinizin əks-sədasıdır.* M.İbrahimov. *"Sevil" tamaşasının rayonlarda əks-sədası daha gurultulu oldu.* S.Rəhman.

2. *məc.* Təsir. *Nədənsə bu vahiməli səsin uzaq əks-sədası beynimdən keçib məni üşütdü.* R.Rza.

**ƏKS-TƏDBİR** *is.* [*ər.*] Bir tədbirə qarşı görülən tədbir.

**ƏKS-TƏKLİF** *is.* [*ər.*] Təklifə qarşı təklif.

**ƏKS-TƏSİR** *is.* [*ər.*] Təsirə əks olan təsir. *Təsir əks-təsirə bərabərdir.*

**ƏKS-TƏZYİQ** *is.* [*ər.*] Təzyiqə qarşı təzyiq.

**ƏKS-ZƏRBƏ** *is.* [*ər.*] Zərbəyə qarşı zərbə.

**ƏQALİM** *is.* [*ər.* "iqlim" söz. cəmi] *köhn.* Ölkələr, iqlimlər, vilayətlər. [Firənglər] .. *sənaye işlətməyə iqdam edib, .. əmtəə hazır edib Firəngistanda və sair əqalimdə hər şəhərin bazar və karvansaralarını .. doldurdular.* M.F.Axundzadə.

**ƏQAYİD** *is.* [*ər.* "əqidə" söz. cəmi] *klas.* Əqidələr, inamlar. *Əgər bu halət, yəni ittifaq sənə müyəssər olsaydı, özünə bir fikir çəkərdin və özünə puç əqayidin qeydindən və despotun zülmündən nicat verərdin.* M.F.Axundzadə.

**ƏQD** [*ər.*] *rəs. köhn.*: **əqd etmək** – bağlamaq. *İki dövlət müqavilə əqd etmişdi.* **Əqd edilmək (olunmaq)** – bağlanmaq. *Dövlətlər arasında müahidə əqd olundu.* **Əqd olmaq** ("nikah" sözü ilə, ya bunsuz) – kəbin kəsilmək. **Nikah (kəbin) əqd etmək** – kəbin kəsmək. *Qazı buradaca dönüb, qiraətlə ucadan oxuyub kəbini əqd etdi.* S.Rəhimov.

**ƏQDƏM** *zərf.* [*ər.*] Qabaq, əvvəl, irəli. [Şair Hacı Nuru:] *..Avar ləzgisi altmış il bundan əqdəm Xanbutayın sərkərdəliyi ilə Nuxanı gəlib çapdığını nəzm etmişəm.* M.F.Axundzadə. *Bir az əqdəm başlamış qar şiddətlə yağırdı.* T.Ş.Simurq.

**ƏQDƏS** *sif.* [*ər.*] *klas.* Ən müqəddəs, çox müqəddəs. *Çeynənildi millətin, neylim, hüquqi-əqdəsi; Ya ki heç bir yerdə yoxdur hörməti, şəni, səsi.* M.Ə.Sabir.

**ƏQDXAN** *is.* [*ər.* əqd və *fars.* ...xan] *köhn.* Dini qaydalar üzrə kəbin kəsmək ixtiyarı olan, kəbin kəsən adam.

**ƏQDXANLIQ** *is. köhn.* Kəbinkəsmə, nikahoxuma.

**ƏQDNAMƏ** *is.* [*ər.* əqd. və *fars.* ...namə] *rəs. köhn.* Əqd kağızı, kəbin şəhadətnaməsi.

**ƏQƏLİYYƏT** *is.* [*ər.*] Sayca azlıq təşkil edənlər; azlıq. *Əqəliyyət çoxluğa tabe olmalıdır.* □ **Əqəliyyətdə qalmaq** – azlıq təşkil etmək, az olmaq. *Əqəliyyətdə qalan millətlər.*

**ƏQƏLL** *zərf* [*ər.*] Daha az, ən az; ən kiçik.

**ƏQƏLLƏN** *zərf* [*ər.*] Ən azı, heç olmazsa. [Əvvəlinci cavan:] *Zarafat deyil, şəhərdən buraya gərək əqəllən üç verst olsun.* Ə.Haqverdiyev.

**ƏQİDƏ** *is.* [*ər.*] 1. İnsanın mühit, həyat və ümumiyyətlə, varlıq haqqındakı düşüncə və inamı; etiqad, inam, məslək. *İki mübhəm sözün nə qiyməti var; Böylə sərsəm əqidədən nə çıxar?* H.Cavid. *Məqsədim, məsləkim, şüarım budur; Həmən əqidədir, həmin duyğudur.* M.Müşfiq.

2. Fikir, qənaət, nöqteyi-nəzər. *Bizim əqidəmizcə, bunlardan "məzlum", "fəqir" .. vəzirlər heç məmləkətdə tapılmaz.* N.Nərimanov. [Vəli:] *Mənim əqidəmcə, duel haram bir əməldir.* Ə.Haqverdiyev.

**ƏQİDƏLİ** *sif.* Müəyyən əqidəsi, məsləki olan, bir şeyə möhkəm inanan; əqidəsində, məsləkində, etiqadında möhkəm olan. *..Sizin nəcib ürəkli və yüksək əqidəli bir adam olduğunuzu görürəm.* M.İbrahimov. // Müəyyən əqidəni, məsləki, dünyagörüşünü təbliğ edən, yayan. *Mütərəqqi ictimai əqidəli ədəbiyyat tələbini böyük yazıçımız klassik mənada şərh edir.* M.İbrahimov.

**ƏQİDƏSİZ** *sif.* Heç bir əqidəsi, məsləki olmayan. [Kürd Əhməd] *..əsəbləri soyuduqda .. bir addım əvəzinə beş addım geri çəkilən əqidəsiz, etiqadsız adamlardandır.* M.İbrahimov.

**ƏQİQ** *is.* [*ər.*] Müxtəlif rənglərə çalan laylardan ibarət olan, qiymətli daş kimi müxtəlif bəzək şeyləri hazırlanmasında və s.-də istifadə edilən bərk mineral. *..Hamısının barmağında qırmızı əqiq üzük parlayırdı.* M.S.Ordubadi. □ **Əqiq kimi** – iri, dən-dən və parlaq. *Narın birini kəsdim. Zoğal kimi iri, əqiq kimi duru gilələri var idi.* Mir Cəlal. **Yəmən əqiqi, əqiqi-Yəmən** – əqiqin qırmızı rəngli əla cinsi (şairanə təşbehlərdə). *Dəryada dişintək dürri-şəhvar tapılmaz;Ləlin kimi kan içrə əqiqi-Yəmən olmaz.* S.Ə.Şirvani.

**ƏQİLLİ** b a x **ağıllı**.

**ƏQİLLİ-BAŞLI** b a x **ağıllı-başlı**.

**ƏQİLSİZ** b a x **ağılsız**. *Dedim*: – *Zülfün mat elədi sünbüli; Dedi*: – *Sən nə bildin, əqilsiz, dəli?* Aşıq Zabit.

**ƏQL** [*ər.*] bax **ağıl**[1]. *Əql meydanını zindani-bəla bilməz hənuz; Kim ki bir müddət cünun mülkünü seyran etmədi.* Füzuli. [Orxan:] *Səbrim tükənmiş, qərarım kəsilmiş; Huşum, əqlim uçmuş, uyqum çəkilmiş.* H.Cavid. *Arvadın bu sözləri .. Usta Ağabalanın əqlinə batdı.* Çəmənzəminli.

**ƏQLƏN** *zərf.* [*ər.*] Ağılca, ağıla görə.

**ƏQLİ** *sif.* [*ər.*] Ağıla əsaslanan, ağıla mənsub, ağılla görülən, ağılla olan; zehni. *Əqli əmək. Əqli iş. Əqli fəaliyyət.* – [Firidun:] *..Sizin əqli və məntiqi dəlilləriniz əleyhinə bir şey demək mümkün deyildir.* M.İbrahimov.

**ƏQL-ŞÜUR** *is.* [*ər.*] Ağıl və düşüncə, dərrakə. [Dərviş:] *Əgər məndə əql-şüur olsaydı...* N.Vəzirov.

**ƏQRƏB**[1] *is.* [*ər.*] 1. *zool.* Quyruğunun ucunda zəhərli iynəsi olan onurğasız həşərat. *Əqrəb sancması. Hər daşı qaldırırsan, altından əqrəb çıxır. Əqrəb zəhərli olur.* – *Hər kəs məndən sənə yaman qandırsa; Ya əqrəb dişləsin, ya ilan, pərim!* Aşıq Abbas.

2. Qədim astronomiyada: on iki bürcdən birinin adı. *Əqrəb bürcü.* – *Xəbər verdi ki, sabah yola çıxmaq olmaz, çünki sabah qəmər Əqrəbdədir.* C.Məmmədquluzadə.

3. *məc.* Gizlindən pislik edən müzür adam haqqında. *Sən ki bir əqrəb imişsən, gerçək; Bu zəhərlər, bu tikanlar nə demək.* H.Cavid. *Basma ayağını bizim torpağa; İlandan, əqrəbdən yar ola bilməz.* S.Vurğun.

**ƏQRƏB**[2] *is.* [*ər.*] Saat, kompas və sairədə öz oxu ətrafında fırlanıb müəyyən işarəni göstərən mil. *Saat əqrəbi. Saniyə əqrəbi. Kompasın əqrəbi.* – ..[Vaqif] *qələmi yerə qoyub saatına baxdı, əqrəblər düz dəstənin üstündə idi.* Çəmənzəminli. *Saatın əqrəbləri on ikiyə yaxındır. Qucaqlaşaq, ayrılaq. Yaxın dur!* R.Rza.

◊ **Əqrəb əqrəb üstündə** – saatın tam 12 olduğunu göstərən ifadə; // bəzən tam vaxtında mənasında. *Nazir .. müşavirənin sabah saat onda əqrəb əqrəb üstündə, .. öz yanında davam edəcəyini bildirdi.* S.Rəhimov.

**ƏQRƏBA** *is.* [*ər.*] Qohumlar (çox vaxt "qohum-əqrəba" şəklində işlənir). *Bu, Hümmətəlinin qohum və əqrəbası idi.* T.Ş.Simurq. [Çopo] *yaşayış şəraiti fənalaşdığı üçün Cəməsb ailəsini və əqrəbaların götürərək Aran ölkəsinə keçir.* Çəmənzəminli.

**ƏQRƏBALI** *sif.* Əqrəbası, qohumu, qohum-əqrəbası, yaxınları çox olan. *Əqrəbalı adam.* – *Daşdəmir ağır əqrəbalı, qoçuluqda şöhrət qazanmış, varlı bir qəssab idi.* A.Şaiq. [İncə:] *Sən bilirsən ki, o* [Aslan bəy] *əqrəbalı bir qurddur?* C.Cabbarlı.

**ƏQRƏBALIQ** *is.* Qohumluq, yaxınlıq. *Aralarında əqrəbalıq vardır.*

**ƏQRƏBALILIQ** *is.* Əqrəbası, qohum-qardaşı, yaxınları çox olma.

**ƏQRƏBASIZ** *sif.* Əqrəbası, qohumu, yaxınları olmayan. *Əqrəbasız adam.* – [Durna:] *..Yoxsul, gücsüz, əqrəbasız, kimsəsiz bu Aydəmir mənim təkcə yoldaşımın qardaşıdır...* C.Cabbarlı.

**ƏQRƏBASIZLIQ** *is.* Əqrəbanın, qohumun, yaxın adamların olmadığı vəziyyət. *Əqrəbasızlıq pis şeydir.*

**ƏQRƏBLİ** *sif.* Əqrəb çox olan. *Əqrəbli səhralar.* – *Əqrəbli çöllərdə bağ-bostan quran; Zəhməti güldürən sənət olacaq.* S.Vurğun.

**ƏQSA** *sif.* [*ər.*] *köhn. kit.* Uzaqda olan, çox uzaq. ☐ **Əqsayi-Şərq** – Uzaq Şərq. *Nə Şərq olaydı, nə Əqsayi-Şərq, həm nə Japonya; Nə onların hünəri xalqa dərsi-ibrət olaydı.* M.Ə.Sabir.

**ƏQSAM** *is.* [*ər.* "qism" söz. cəmi] *köhn. kit.* Növlər, cinslər. *Cücələrin köklüyünü, yağlı-yağsız olduğunu, mürəbbələrin əqsamını və s.-ni gözdən keçirən çox idi.* M.S.Ordubadi.

**ƏQVAM** *is.* [*ər.* "qövm" söz. cəmi] *kit.* 1. Tayfalar, qövmlər. *Vətəndaşlarımın bu tərəqqi zamanında, bu telefon və elektrik əsrində ki, – sair miləl və əqvam artıq sürətlə irəli gedib özləri üçün ixtiyarlar və imtiyazlar axtarmaqdadırlar, – geridə qalmaqları .. məni heyrətə saldı.* F.Köçərli. // Tayfa.

2. Qohumlar, qohum-əqrəba. *Ona görə bu şəxs nəinki .. öz əqvamının, bəlkə cəmi şəhər əhlinin əlindən getdi.* Ə.Haqverdiyev. *Ağanın özünün və əqvamının salamatlığı təmin olunmalıdır..* M.S.Ordubadi.

**ƏL** *is.* 1. Qolun biləkdən dırnaqlara qədər olan hissəsi. *Əli ilə tutmaq. Sağ əl. Əllərini yumaq. Əlini çiyninə qoymaq. Əli ilə sığallamaq. Əli ilə götürmək. İnsan işlərinin çoxunu əlləri ilə görür. – Tək əldən səs çıxmaz.* (Ata. sözü). *Əfsus ki, qocaldım ağacım düşdü əlimdən; Səd heyif cavanlıq!* M.Ə.Sabir.

2. Bəzi heyvanların qabaq ayaqlarının hər biri. *Meymunun əlləri adam əlinə oxşayır. Pişik əlləri ilə üzünü yuyur.*

3. Dəfə, kərə, yol (adətən saylarla). *Bircə əl oynayaq. – Bu əsnada yaxında dörd-beş əl şiddətli tapança atılır.* H.Cavid. *İki əl səpdikdən sonra çuxasının ətəyini silkələyərək gəlib cütün dəstəsindən yapışdı.* S.Rəhimov.

4. İştirak, əlaqə. ☐ **Əli ilə** – vasitəsilə, köməyi ilə. *Başqasının əli ilə iş görmək.* – **Əli olmaq** – iştirakı, müdaxiləsi, əlaqəsi olmaq. *Bu işdə onun da əli var. – Bilirsənmi, yoldaş Tərlan, burada sinfi düşmənlərin əli var.* M.Hüseyn.

5. **Əlində**, **əlimdə** və s. – malikiyyət, ixtiyar, iqtidar, idarə, sərəncam, asılılıq mənasında. *Bu iş mənim əlimdədir.* ☐ **Əlində olmaq** – 1) imkanı, ixtiyarı, bacarığı, iqtidarı dairəsində olmaq. *Gəncləşmək* [Muradın] *əlində deyildi. Onu təbiət qocaltmışdı.* S.Hüseyn; 2) ixtiyarında, hakimiyyətində, sərəncamında, asılılığında, idarəsində olmaq.

6. Əllə görülən işdə məharət, bacarıq mənasında. *Cərrahın əli ağırdır. Rəssamın gözəl əli var.*

7. Növbət, sıra. *Əl kimdə isə oynasın. İndi mənim əlimdir.*

8. Tərəf, yan. *Sağ əldə oturmaq. Sol əldəki mağazaya getdim. – Qazmaçı Kərim .. yolun sağ əlində yamacdakı birmərtəbəli, uzunsov evdə yaşayırdı.* M.İbrahimov.

9. **...əlindən** şəklində işlənərək səbəb bildirir. *İş əlindən macal tapmır. Adam əlindən gəzməyə yer yoxdur. – Hicr əlindən pərişanam yüz ildi.* Q.Zakir. *Çala-çuxur əlindən maşınlara gün yox idi.* Ə.Əbülhəsən.

10. Çıx. halında: **əldən** *zərf* – 1) tez, cəld, gözləmədən, qaçaraq, əlbəəl. *Əldən bir papiros al! Əldən beş manat verdi;* 2) mağazadan yox, əldə satandan. *O, əldən bir samovar aldı.*

11. Yerl. halında: **əldə** – 1) mövcud, faktik. *Əldə olan məlumata görə. – Kömək etmək imkanı əldə ikən bu vəzifədən boyun qaçırmaq .. insanlıq sifətini itirmək deməkdir.* M.S.Ordubadi; 2) *riyaz.* Yadda, fikirdə, nəzərdə, xatirdə. *İki yazırıq, bir əldə.*

12. Bir çox mürəkkəb alət və s. adlarının birinci tərkib hissəsi olub, onların kiçik, əllə, ya əldə işləndiyini göstərir; məs.: əl arabası, əl mişarı, əl fənəri, əl tərəzisi, əl pulemyotu.

13. Əldə böyüdülmüş, ələ öyrədilmiş, əhliləşdirilmiş mənasında heyvan, quş adlarının əvvəlinə gətirilir; məs.: əl toğlusu, əl tulası, əl göyərçini.

◊ **Əl açmaq** – 1) əl qaldırmaq, əllərini işə salmaq, zor işlətmək. *..İnşaallah, bizi görən kimi yükləri töküb qaçacaqlar, qaçmasalar, əl açsalar – hamısını xingal kimi doğrayacağam.* M.F.Axundzadə; 2) müraciət etmək, istəmək. *İşdir, gedib qulluq tapmadım, kəndə qayıtmağa da pulum olmadı, onda kimə əl aça bilərəm?* M.Hüseyn. // Yalvarıb xahiş etmək, dilənmək. *Eşqin əsiri olmayın; Əl açıb, boyun burmayın.* Aşıq Hüseyn. **Əl ağacı** – yeriyərkən söykənmək üçün əldə tutulan nazik ağac. *Əl ağacı adama əyri görünər.* (Ata. sözü). [Qərənfil xala] *bucaqdakı əl ağacı ilə qapını örtdü.* Ə.Vəliyev. **Əl altında** – 1) hazır, amadə. *Əl altında saxlamaq;* 2) yanında, rəhbərliyi altında. [Xavəri] *evlərinə atasının əlinin altında işləməyə aparmışdı.* M.İbrahimov. **Əl altından çıxmaq** – ustanın əli altında öyrənərək təcrübə hasil etmək. **Əl aparmaq** – əl uzatmaq, əl atmaq. [Axund:] *Axı, belə müsəlmançılıq olmaz, .. axır qurana da əl apardın?* C.Cabbarlı. **Əl atmaq** – 1) girişmək, təşəbbüs etmək. *O, hər işə əl atır. – Düz deyirsən, əmi, bu peşəyə təzə əl atmışam, .. özüm aqronomam.* "Kirpi"; 2) istifadə etmək, tətbiq etmək, müraciət etmək. *Ciddi tədbirlərə əl atmaq. – Mürtəcelər demokratik hərəkatı ləkələmək və pozmaq üçün hər cür iftira və fitnə-fəsada əl atırlar.* M.İbrahimov; 3) əlini uzatmaq. *Əl atıb götürdü. Əl atıb cibindən papiros çıxartdı.* – [Yaşlı kişi:] *İki saatdan bəri min müşkülatla*

*doldurduğum səbətə* [Şirinnaz] *əl atıb onu qaldırmaq istədi.* S.Hüseyn. // Əlini uzadıb götürmək. *Ancaq mən Eldarın könlünə dəyməmək üçün daha tüfəngə əl atmadım.* M.Rzaquluzadə; 4) sataşmaq, təcavüz etmək istəmək. [Məşədi Qədir:] *Bəli, yoldaşlar, ərz eləyirəm ki, bizim namusumuza əl atıblar.* T.Ş.Simurq. *Gördüm ki, əl atır bir zabit qıza.* M.Rahim; 5) birini buraxıb o birisindən yapışmaq, başlamaq. *..Bu məktəbdən çıxıb, o məktəbə girib, bu rayondan üzülüşüb, o biri rayona əl atıb.* S.Rəhman. **Əl ayası** – ovucun içindəki düz yer. **Əl bağlamaq** – hazır durmaq. **Əl basmaq** – and içmək. *O, ürəyinə əl basıb söz verdi.* **Əl boyda** – çox kiçik, lap balaca, bir qırıq. *Əl boyda kağız. – Hər dəfə əl boyda qəbzlərə, ya dilucu tapşırığa, anbar açdırıb taxıl buraxanacan Gəldiyevin canı boğazına yığılırdı.* Mir Cəlal. **Əl bulamağına dəyməz** – dəyərsiz, lüzumsuz, faydasız, heç bir xeyir gözlənilməyən şey haqqında. **Əl cəldliyi** – cəldlik, əldən itilik, əl itiliyi. *Əl cəldliyi cərrah üçün vacib şərtdir.* **Əl çalmaq** – 1) alqış əlaməti olaraq əllərini biri-birinə çırpmaq, alqışlamaq. *Artistə hamı əl çaldı. Oynayanlara əl çalmaq. – Həyətdə palaz döşənib samovar qoyulmuşdu. Mollabacı mis ləyəni dınqıldadıb oxuyurdu, mütəəllimələr də əl çalırdılar.* Çəmənzəminli. *..Fəhlələr müdiriyyət tərəfindən "intizamı" qorumaq üçün əvvəlcədən görülən tədbirlərə baxmayaraq, dəzgahların başındaca durub əl çalır.* M.İbrahimov. *Hamı irəli boylanaraq əl çalırdı.* Ə.Məmmədxanlı; 2) sevinmək. *Ağlama, dəli könlüm; Düşmən görər, əl çalar.* (Bayatı). **Əl çatmaq** – əldə edilməsi mümkün olmaq, ələ gəlmək. **Əl çəkmək** – 1) buraxmaq, boşlamaq, əlaqəni kəsmək. *Hacı Sultan ticarətdən tamamilə əl çəkib iki evindən aldığı kirələrin sayəsində rahatlıqla keçinirdi.* S.Hüseyn; 2) vərdiş etdiyi bir şeydən imtina etmək, daha etməmək, buraxmaq, tərk etmək. *Papirosdan əl çəkmək. Pis adətlərdən əl çəkmək.* – [Heydər bəy:] *Guya ki, bütün Qarabağda dana-doluq oğrusu bir Heydər bəydir! Əyər o əl çəkə, ölkə farağat olar.* M.F.Axundzadə; 3) vaz keçmək, imtina etmək. *Öz məqsədindən* (*fikrindən*) *əl çəkmək;* 4) keçmək. *Ay dəmdəməki, sən .. necə qorxmadın, o sözləri mənə yazdın? Məgər sən canından əl çəkibsən?* C.Məmmədquluzadə; 5) üz döndərmək, daha özününkü hesab etməmək, dönmək, əlaqəsini kəsmək. *Öz ata-anasından əl çəkmək. Öz övladından əl çəkmək;* 6) rahat buraxmaq, əl götürmək, yaxasını buraxmaq. *Axır ki, hərif bizdən əl çəkdi. – Rüstəm bəy: – Məhəmmədəli, səni and verirəm atanın goruna, məndən əl çək!* C.Məmmədquluzadə. *Bu sirri öyrənməmiş onun yaxasından əl çəkməyəcəyik.* M.Hüseyn; 7) b a x **əl qoymaq** 2-ci mənada. *Qoca qarı uşağın başına əl çəkdi.* **Əl çirki** – pula ikrah və etinasızlıqla verilən ad. [Məşədi:] *Pul deyəndə, əl çirkidir, rəhmətlik ilə duz-çörək yemişik.* Ə.Haqverdiyev. **Əl çırpmaq** – b a x **əl çalmaq**. **Əl dəymək** – əl vurmaq, toxunmaq. *Bu eldə bir dənəyəm; Əl dəymə, pərvanəyəm; Yarım gedib səfərə; Dərdinnən divanəyəm.* (Bayatı). [Qərib:] *Üç gözəlin biri bizə qohumdur; O birisi əl dəyməmiş qovundur.* "Aşıq Qərib". *Sal dəmiri kürədə qızdırıb gavahının burnundan çiyninə kimi elə yapışdırdı ki, baxanda deyərdin, əl dəyməyib..* S.Rəhimov. **Əl eləmək (etmək)** – 1) çağırmaq əlaməti olaraq əlini yelləmək, əli ilə işarə edib çağırmaq. *O, əl elədi, mən yanaşdım.* – [Mirzə Səfər] *dönüb gördü ki, o səsləyən Həsən ağadır, tacir Hacı Qulunun dükanında oturub oradan əl edir.* Ə.Haqverdiyev; 2) xudahafizləşmə əlaməti olaraq əlini yelləmək. [Tahir] *..qıza əl elədi və sürətlə uzaqlaşdı.* M.Hüseyn. *Bizim dərya könlümüzdə Vətən eşqi var; Sür gəmini, qoy sahildən əl eləsin yar.* Ə.Cəmil. **Əl əməyi (zəhməti)** – əllə görülən iş. *Əl əməyini yüngülləşdirmək.* **Əl əsası** *məc.* – dayaq, söykənəcək. *Gözəl bir qız sevib almaq, qocalığın əl əsasıdır, – dedi.* A.Şaiq. **Əl əti** *məh.* – evdə kəsilən heyvanın əti. **Əl gəzdirmək** – 1) əllə bir şeyi nizama, səliqəyə salmaq, yaxud pozmaq, qarışdırmaq. *Bu kitablara yenə kim əl gəzdirib, heç biri öz yerində deyil. – Xankişi stullara əl gəzdirməyə başladı. Hamını növbə ilə bir arvad, bir kişi düzdülər.* Mir Cəlal. // Araşdırmaq, əlləşdirmək; 2) üzərində bir qədər

işləmək, düzəltmək. *Əlyazmasına bir əl gəzdirmək lazımdır;* 3) oğurlamaq, soyub aparmaq. *Evinə yaxşıca əl gəzdirdilər. – Qalxdı hirslə ayağa; Soyğunçular adətincə əl gəzdirdi otağa.* Ə.Cəmil. **Əl gəzmək** – əl toxunmaq, əl dəymək. *Aşıq Ələsgər məsti aldı. Baxtı gördü ki, zalım oğlu elə tikib ki, elə bil heç üstündə əl gəzməyib; iki göz gərək tamaşa eləyə.* "Aşıq Ələsgər". **Əl götürmək** – b a x **əl çəkmək**. *Mərd olanlar keçər külli varından; Əl götürməz namusundan, arından.* M.V.Vidadi. [Mirzə Turab:] *..Əlləşdim, vuruşdum, çox zəhmət çəkdim, amma siz yenə cəhalətdən əl götürmədiniz.* B.Talıblı. [Şamama Cadu:] *A gədə, itil cəhənnəmə, yaxamdan əl götür!* Ə.Haqverdiyev. *Yasəmən onun evindən əl götürmək, yorucu əzabdan qurtarmaq istəyirdi.* Mir Cəlal. **Əl ilişdirmək** – bir işlə məşğul olmağa başlamaq. **Əl işi** – maşın vasitəsilə deyil, əllə görülən iş, əl vasitəsilə hazırlanan şey. *Kurs, klub, əl işi, zəhmət nə demək, can nə demək? On beş arşın güllü çitdəndi tumanım, çadra!* Ə.Vahid. **Əl kiri** – b a x **əl çirki**. **Əl kölgəliyi** – vaxt, imkan. [İbrahim bəy:] *..Gəldilər mənim yanıma ki, bəy, Allah xatirinə, bizə bir əl kölgəliyi ver, gedək Camal bəyin yanına.* N.Vəzirov. **Əl qaldırmaq (qalxızmaq)** – 1) kimisə vurmağa təşəbbüs etmək. *Heç kəs sənə əl qaldıra bilməz.* – [Kəndlilər:] *Qulamhüseyn bəyə də əl qalxızmaq olarmı? Hüseynqulu bəyi də həbsə almaq olarmı?* B.Talıblı. *Bu .. nə qiymətli adamdır ki, onun üstündə əziz qardaş mənə əl qaldırdı?* S.Rəhman; 2) səsvermə zamanı əlini qaldırmaqla lehinə səs vermək. *O, yerli komitəyə seçiləndə mən ona əl qaldırmışam;* // əlini qaldırmaqla lehinə, ya əleyhinə səs vermək. *Bəzi kəndlilərə də kimin lehinə, kimin əleyhinə, nəyə qarşı əl qaldırmağı başa salmaq çətin idi.* Mir Cəlal. [Səfərəli:] *Kim tətil tərəfdarı isə, əlin qaldırsın.* H.Nəzərli; 3) təslim, tabe əlaməti olaraq əlini və ya əllərini yuxarı qaldırmaq; 4) dua etmək; 5) əlini qaldırmaqla söz istəmək. *..Solmaz əlini qaldırıb söz istədi.* S.Rəhimov. **Əl qatmaq** – 1) qarışmaq, məşğul olmaq, işə qarışmaq. *Yüzbaşının ayağına buxov vuran kimi, bizə də əl qatarlar.* Ə.Haqverdiyev. *Bu adam fağır-məzlumun birisi olmasa, heç əl qatmaram.* Mir Cəlal. *Hər bir işə əl qatdı, mürüvvət götürüldü! Millətdə olan büsbütün adət götürüldü.* M.Ə.Sabir; 2) yapışmaq. *Nə bilim Zalxa dua yazdıracaq at nalına; Təzə arvad da bunun əl qatacaqdır yalına..* Ə.Nəzmi. **Əl qoymaq** – 1) razı olmaq, razılığını bildirmək. [Hacı Mehdi:] *Əgər bu işə əl qoyacaqsan qoy, qoymayacaqsan onu de..* Ə.Haqverdiyev; 2) mövhumata inanan şəxslərin duazikr etməklə adamın (xüsusilə bərk qorxmuş adamın) başına əl çəkmək şəklində icra etdikləri dini ayin. *Çox adam əhlü əyalın aparıb qoydurub əl; Xalq hərçənd deyir özgə təhər böhtanı.* S.Ə.Şirvani. **Əl mənim, ətək sənin** – yalvarış ifadəsi. *Atım, tutum alma, yar; Evdə yalqız qalma, yar; Əl mənim, ətək sənin; Nəzərindən salma, yar.* (Bayatı). **Əl ovuşdurmaq** – peşman olmaq, məyus olmaq, çaşmaq. *Əl ovuşdurmaqdan nə çıxar, indi çalış, bundan sonrasını düşün.* **Əl oyunu** – idmanın tennis, voleybol, basketbol və s. kimi əllə oynanılan növlərindən hər biri. *Üç gündür ki, mərkəzi əl oyunları stadionunda əltopu üzrə Bakı məktəbliləri arasında birincilik yarışları keçirilir.* (Qəzetlərdən). **Əl saxlamaq** – toxtamaq, dayanmaq, icra etmək istədiyi işi, hərəkəti dayandırmaq. *Qoy musiqi dilə gəlsin, çağlasın; Uzun sözə qıfil vurub bağlasın; Kim bacarmır çalmasın, əl saxlasın.* R.Rza. *Bu uğursuz niyyətinlə bir əl saxla, sən bir dayan.* N.Rəfibəyli. *Qardaş oğlanları, yeməkdən əl saxlamayın.* M.Rzaquluzadə. **Əl satışı** *xüs.* – əldən satış, malı əldən satma; apteklərdə reseptsiz satış. **Əl sıxmaq** – əl verərək görüşmək, salamlaşmaq. *Əl sıxmaq, qucaqlaşmaq və öpüşmək bitdikdən sonra .. yoldaşları ilə birlikdə .. şayiələri müzakirə üçün çağırılmış iclasa getdi..* M.S.Ordubadi. **Əl suyu** – Şərq adətincə yeməkdən qabaq əlləri yumaq üçün qonağa təklif edilən su. *Yemək xonçaları aralığa gəlmədən əl suyu verdilər.* M.S.Ordubadi. [Pərzad xala] *bişirdiyi xörəyin şirin yeyilməsindən bildi ki, o, hər şeydə naşı olsa da, əl suyu verməklə aş bişirməkdə ustadır.* Mir Cəlal. **Əl tapmaq** – üstün olmaq, qalib gəlmək. *Əl ki tutmur ya-*

*zam, əl tapmaqda; Qələmə, ya davata, bilməyirəm.* Şəhriyar. **Əl tərpətmək** – 1) işi yubandırmamaq üçün tələsmək, cidd-cəhd göstərmək, daha cəld işləməyə başlamaq. *Bircə əl tərpət, bu işlərə bir əncam ver. – Ancaq biz bu məsələ ilə əlaqədar olan yoldaşları inandırırıq ki, bir az əl tərpətsələr, bu iş nəinki əlli il, heç əlli saat da qalmaz.* "Kirpi"; 2) vurmağa hazırlaşmaq, vurmaq istəmək, əl qaldırmaq. **Əl toxundurmaq** – qarışmaq, müdaxilə etmək. *Əl toxundurmağa dəyməz.* **Əl tutmaq** – 1) əllərini bir-birinə verməklə görüşmək. [Cavad] *sonra da ev yiyəsi ilə əl tutaraq əlavə etdi*: *– Mənə göstərdiyiniz qonaqpərəstliyə dərindən təşəkkür edirəm.* Ə.Vəliyev; 2) razılığa gəlmək, razılaşmaq əlaməti olaraq bir-birinə əl vermək; 3) yardım etmək, maddi kömək etmək, borc vermək. *Əl tutanın əlindən tutarlar.* (Ata. sözü). *Bəzirgan Əhməd gəlib bunlara əl tutmaq üçün pul verdi.* "Aşıq Qərib". *Ancaq o, darda qalana .. əl tutar, sonra isə bir verdiyinə beş alardı.* S.Rəhimov. *Varlı qohumlarımdan heç biri belə dar gündə mənə əl tutmadı.* C.Cəbrayılbəyli. **Əl tutuşmaq** – b a x **əl tutmaq** 1-ci mənada. *Tahir onunla əl tutuşanda qocanın elə bil barmaqlarında toplanmış qüvvətini çox yaxşı hiss elədi.* M.Hüseyn. **Əl uzatmaq** – 1) almağa, ələ keçirməyə, əldə etməyə təşəbbüs etmək. *Başqasının şeyinə əl uzatmaq;* // götürmək üçün əlini uzatmaq; // şüru etmək, başlamaq. *Axşam azanı deyilən kimi, mömin müsəlman bilmir ki, nəyə əl uzatsın*: *çaymı içsin, firnimi yesin, halvadanmı dadsın.* C.Məmmədquluzadə. *Uşaq xörəyə də əl uzatmadı.* Mir Cəlal; 2) sataşmaq, namusuna toxunmaq istəmək, əl atmaq. [Vəzir:] ..*Günün günortasında mənim kimi kişinin evinə giribdir ki, övrətimə əl uzatsın.* M.F.Axundzadə; 3) kömək istəmək, kömək diləmək, kömək üçün birisinə müraciət etmək. *Başqasına kömək üçün əl uzatmaq;* 4) kömək etmək, yardım etmək, kömək əli uzatmaq. *Əlacın olanda el üçün ağla; Yoxsula əl uzat, nəzarət eylə!* Aşıq Şəmşir; 5) girişmək, başlamaq. [Mozalanbəy:] *Sən elə məsələlərə əl uzatma.* Ə.Haqverdiyev. **Əl üstündə əl var** – hər adamdan daha güclü adam var. **Əl üstündə kimin əli** – Azərbaycan xalq oyunlarından birinin adı. **Əl üzmək** – ümidini kəsmək, daha gözləməmək. *Əzizim gedər, qalmaz; Axar su gedər, qalmaz; Vəfalı əlin üzməz; Vəfasız gedər, qalmaz.* (Bayatı). *Vidadi ortaboylu, çalsaqqal, .. çox dindar və dünyadan əl üzmüş bir adam idi.* Çəmənzəminli. *Üç aydır ki, ormanların arasında yataraq; Əl üzmüşdür vətənindən, millətindən Gəray bəy.* S.Vurğun. *Həmin vaxtdan əl üzmüşdü hamı buruqdan.* Ə.Cəmil. **Əl verir** – bəsdir, yetər, kifayətdir. *Əl verir, başqa söz danış.* **Əl vermək** – 1) əl-ələ tutmaqla görüşmək. *Onlar bir-birlərinə əl verdilər. – Rast gəlir yenə də dostlar, tanışlar; Görüşür, əl verib öpüşürük biz.* S.Vurğun; 2) işə yaramaq, xeyirli olmaq, əlverişli olmaq. *Bu iş ona əl vermir. – Bahəm söhbət edə-edə gedərik. Təklik mənə də əl verməz.* Ə.Haqverdiyev; 3) üz vermək, baş vermək, olmaq. *Peşmançılıq əl verdi. Yorğunluq əl verdi. – Koroğluya yalqızlıq əl vermişdi.* "Koroğlu". *Qeyrət mənə əl verib, bir dəqiqə çəkməyib, Teymur ağanı çəkdim pişləngə.* M.F.Axundzadə. **Əl vurmaq** – 1) toxunmaq, dəymək. *Hər şeyə əl vurur. Kitablara heç əl vurmamışam. – Bağında bax narınca; Əl vurma saralınca.* (Bayatı); 2) qarışmaq, girişmək, toxunmaq, müdaxilə etmək. *Sən bu işə əl vursan, mən qarışmayacağam;* 3) əl çalmaq. *Əl vurun, cərgə durun; Sonadır, yaylağa gəlir.* Aşıq Nəcəf. *Döyüşçülər ayağa qalxaraq əl vurur*: *– Xalqımıza bizim təşəkkür və salamımızı yetirin! – deyə qışqırırlar.* M.İbrahimov; 4) b a x **əl basmaq**. *Gülzarına Quran deyə əl vurdum; İnanmadın niyə, gülmədin yəni.* Ə.Cavad. **Əl yaylığı** – əl, burun silmək üçün cibdə gəzdirilən kiçik yaylıq. *Cibindən əl yaylığını çıxarıb tərini sildi.* **Əl yeri** – müraciət etmək, sonradan məsələyə qayıtmaq, yenidən danışıq aparmaq üçün vasitə, bəhanə. *O, təklifi rədd üçün yenə bir əl yeri saxladı. – Bircə düyün, yapışmağa bir əl yeri; Bir anlığa səni, səni xilas üçün; Tapılmadı.* M.Araz. **Əl yetirmək** – kömək etmək. *Ay qadaşlar, mənə bir əl yetirin; Yüküm ağırdı, çata bilməyirəm.* Şəhriyar. **Əl yetmək** – b a x **əl çatmaq**. *Göyərçin havada-*

*dır; Əl yetməz, yuvadadır.* (Bayatı). **Əl(lər)i duada** *din.* – dua oxumaq məqsədi ilə əllərini qaldırmış halda. *Şəhərin kənarı, camaat ayaq üstə, əlləri duada, dodaqları dua vird edir.* C.Məmmədquluzadə. **Əl(lər)ini döşünə qoymaq** – ehtiram, yaxud razılıq əlaməti olaraq əllərini döşünə qoyub təzim etmək. *Xəlilin anası üzünü örtüb küncə girdi və Xəlil də əlini döşünə qoyub, mollasına təzim edib ədəblə durdu.* Ə.Haqverdiyev. **Əl(lər)ini qaldır!** – "tabe ol! təslim ol!" mənasında düşmənə əmr. **Əldə bəhanə etmək** – əsaslanmaq, bəhanə etmək. *..Şəriəti əldə bəhanə edib, biçarə avam camaatı öz qərəz və mərəzimizə alət edirik.* C.Məmmədquluzadə. **Əldə bəsləmək** – ev şəraitində, əldə saxlamaq, ələ öyrətmək, əhliləşdirmək. *Bu ayı meşə ayısı deyil, əldə bəslənmiş ayıdır.* S.S.Axundov. **Əldə böyümək** – ev şəraitində, ailədə tərbiyə almaq, böyümək. *Bəy, eyib olmasın soruşmaq, əldə böyümüsüz, yoxsa meşədən tutulmusunuz?* N.Vəzirov. **Əldə etmək** – bir şeyə nail olmaq, ələ keçirmək, tapmaq, qazanmaq. *İmkan əldə etmək.* – [Yaşlı kişi:] *Münasib bir fürsət əldə edincə bu arzumu anama açacaqdım.* S.Hüseyn. *Zabit nə qədər axtarmışdısa, vəsiqə adlı bir parça kağız əldə edə bilməmişdi.* M.S.Ordubadi. **Əldə gəzdirmək** – həddindən artıq əzizləmək. **Əldə qoymaq** – üzdə, əl çatan yerdə qoymaq, əl altında, hazır vəziyyətdə saxlamaq. *Gedəndə açarı əldə qoy.* **Əldə ölmək** – 1) öldürülmək. *Çillə gərək şəhid qəbri üstündə, yəni əldə ölmüş bir adamın qəbrinin üstündə kəsilsin.* Ə.Haqverdiyev; 2) başqalarının əhatəsində ölmək. **Əldə saxlamaq** – 1) b a x **əldə bəsləmək;** 2) əldən verməmək, özü üçün saxlamaq. [Tın-tın Musanın oğlu:] *Bəlkə bir növlə dükanımızı əldə saxlayaq. Kim kimədir?* Qantəmir; 3) gələcəkdə lazım ola biləcək bir şəxsi hörmətlə, yaxud naz və arzusu yerinə yetirilməklə öz tərəfinə çəkmək. *Min dəfə sənə deyirəm, maymaq böyükləri əldə saxla, adamın olsun.* Mir Cəlal. **Əldən almaq** – 1) ələ keçirmək, sahib olmaq, yiyələnmək, ixtiyarına almaq. *Bütün hakimiyyəti ələ almaq;* 2) öz iradəsinə tabe etmək, öz tərəfinə çəkmək. [Sona] *bir az da yanaşır və onu ələ almaq istəyir.* H.Nəzərli. **Əldən buraxmaq** – 1) fürsəti qaçırmaq, ötürmək; 2) əl çəkmək, boşlamaq; 3) qaçırmaq, qaçmağına imkan vermək. *Gözətçi həmsöhbətini əldən buraxdığına təəssüfləndi və papiros eşib balaca müştüyünə keçirdi.* İ.Şıxlı. **Əldən çıxarmaq** – 1) b a x **əldən qaçırmaq**; 2) köhnəltmək, üzmək, dağıtmaq. *Kostyumlarını geyib əldən çıxarmaq;* 3) bir işi görüb qurtarmaq, tamamlamaq. *Tut ağacın darama; Əldən çıxar barama; Halal zəhmətlə gələr; Haram gedər harama.* (Bayatı). **Əldən çıxmaq** – 1) qeyb edilmək, itirilmək, yox olmaq. *Var-dövlət əldən çıxdı. – Doğrudan, uşaqlıq bir gözəl nemət imiş ki, əldən çıxdı.* C.Məmmədquluzadə; 2) köhnəlmək, yıpranmaq, əldən düşmək. *Paltarı lap əldən çıxıb;* 3) aradan çıxmaq, qaçmaq, əkilmək, ortadan yox olmaq. [Qasım kişi:] *Bala, bir az qıvraq qaçın, əldən çıxın..* C.Məmmədquluzadə; 4) qayrılmaq, hazırlanmaq, istehsal edilmək. *Əldən çıxmış məhsul. Bu qab yaxşı əldən çıxıb.* **Əldən düşmək** – 1) zəifləmək, haldan düşmək, üzülmək, halsızlaşmaq. *O qocalıb lap əldən düşübdür. Uşaq qaçmaqdan əldən düşdü. – Anası bilər, bir də qızı, mən daha yorulub əldən düşmüşəm.* S.Rəhimov; 2) yoxsullaşmaq. *Var-yoxu gedib, əldən düşüb;* 3) dağılmaq, köhnəlmək, yıpranmaq. *Evin balkonu əldən düşüb. Ayaqqabılarım lap əldən düşüb.* **Əldən getmək** – 1) son dərəcə istəmək, sevmək, arzulamaq. *Onda nə görmüsən ki, əldən gedirsən;* // nazını çəkmək, son dərəcə əzizləmək. *Ana uşağı üçün əldən gedir;* 2) məhv olmaq, puça çıxmaq, heç olmaq, xarab olmaq, əldən çıxmaq. *Taxıl əldən gedir, tez sulamaq lazımdır. – Yalnız, nə deyim, getdi mənim millət əlimdən; Torpaq başıma, çıxdı bütün izzət əlimdən.* M.Ə.Sabir. [Birinci kəndli:] *Əlac elə, aşağı bağlar əldən getdi.* H.Nəzərli. **Əldən qaçırmaq** – b a x **əldən buraxmaq**. **Əldən qoymaq** – əldən buraxmaq, əldən qaçırmaq. **Əldən qoymamaq** – 1) buraxmamaq, tərgitməmək, daha yada salmamaq. *Zarafatı əldən qoymur. – Dəvədən yıxılıb höt-hötünü əldən qoymur.* Ə.Haqverdiyev; 2) əl çəkmək, narahat etmək. [Bala-

xan:] *Xeyr ha, sən öləsən, əldən qoymaram.* C.Cabbarlı. *Ancaq nə edəsən ki, aylardan bəri başında yer eyləyən şirin niyyətlər Gəldiyevi əldən qoymurdu.* Mir Cəlal. **Əldən qurtarmaq** – xilas olmaq, canını qurtarmaq. **Əldən nə gələr** – nə etmək olar, çarə yoxdur. [Rəhim:] *İndi iş işdən keçəndən sonra əldən nə gələr?* H.Nəzərli. **Əldən salmaq** – çox yormaq, əziyyət vermək, üzmək. *Qova-qova toyuğu əldən salıb tutdu. Heyvanı döyə-döyə əldən saldı. Səs-küy bizi əldən saldı.* – [İbad:] *Şəhəri əldən salmışsınız, indi də gəlib bizə əl uzadırsınız?* C.Cabbarlı. **Əldən tutmaq** – kömək, yardım etmək. [Məsmə:] *Mən səni böyüdüb bir tikə çörək gətirən, əldən tutan eləmək istəyirəm.* Mir Cəlal. **Əldən vermək** – davam etdirə bilməmək, saxlaya bilməmək. *Təşəbbüsü əldən vermək. Bayrağı əldən vermək.* **Əldən yapışmaq** – bax **əldən tutmaq**. **Əldən-dildən düşmək** – bax **əldən düşmək**. **Əldən-dildən salmaq** – bax **əldən salmaq**. **Əldən-ələ düşmək (keçmək)** – 1) qapıbaqapı düşmək, müəyyən bir yeri, məskəni olmamaq. *Göyərçinəm, uçdum, gəl; Əldən-ələ düşdüm, gəl.* (Bayatı); 2) birisindən başqasına keçmək, bir-birinə ötürülmək. **Əldən-ələ gəzmək** – 1) çox əziz olmaq, hamının istəklisi olmaq, çox qiymətli, dəyərli olmaq. *Uşaq əldən-ələ gəzir;* 2) çox rəvac olmaq. *Əldən-ələ gəzir malı Təbrizin.* "Aşıq Qərib". [Qurbani:] *Xasiyyətdi, əldən-ələ gəzirsən; Yoxdu sana qorxu-qadağa, alma!* "Qurbani"; // çox oxunmaq, hamı tərəfindən sevilib oxunmaq. [Nurcabbar Bağıra:] *Bax, sənin xoşuna gəlib. Gör dünyada sənin təkin nə qədər adam var? Nağıllarımı ortalığa çıxartsam, əldən-ələ gəzər.* İ.Məlikzadə. **Ələ baxmaq** – möhtac olmaq, maddi cəhətdən başqasından asılı olmaq, ondan yardım gözləmək. *İndi qocalmışdır, işləyə bilmir, ələ baxır.* // Başqasının öhdəsində olmaq. *Cavankən tənbəllikdən ələ baxır.* **Ələ dolamaq** – aldatmaq, oynatmaq. *..Camaatı ələ dolamaq zarafat deyil.* Ü.Hacıbəyov. **Ələ düşmək** – 1) tapılmaq, ələ keçmək, hasil olmaq. *At ələ düşər, ot ələ düşməz.* (Ata. sözü). *Bidamaq olmaqdan nə düşər ələ; Şükr elə Allaha, gəz gülə-gülə!* M.P.Vaqif. *Axtarıram, uşaqlıq düşmür ələ.* A.Səhhət; 2) tutulmaq, yaxalanmaq, ələ keçmək, girə keçmək. *Səni göydə axtarırdım, yerdə əlimə düşmüsən.* – *Bəyin adamları Cəfərqulunu bərk axtarırdı, harada ələ düşsəydi, o dəqiqə öldürəcəklərdi.* Qantəmir. *Çıxdın aralıqdan, düşmədin ələ.* R.Rza. *Allah eləməsin, əllərinə düşəsən. Özünü gözlə, dost!* S.Vəliyev. **Ələ gələn** – hasil, hasil olan, əldə edilən. **Ələ gəlmək** – əldə edilmək, hasil olmaq. *Ancaq iki il o mahalda quraqlıq keçdi, əkindən heç bir şey ələ keçmədi.* B.Talıblı. **Ələ gətirmək** – əldə etmək, ələ keçirmək, nail olmaq. *Demək olar ki, behiştdə vədə olunan ləzzətlərin hamısını Tiflisdə qışda ələ gətirmək olar.* C.Məmmədquluzadə. **Ələ girmək** – bax **ələ düşmək**. *Elm pul ilə ələ girməz, ancaq çalışmaq ilə qazanılar.* "Məktəb". **Ələ xına qoymaq** – 1) əllərini xına ilə boyamaq. *Köhnə adətlərdən biri ələ xına qoymaq idi.* H.Sarabski; 2) *məc.* şərikli işdəki xeyirdən yoldaşın əlini çıxarmaq. **Ələ keçirmək** – 1) tapmaq, əldə etmək. *Hər şeydən əvvəl ələ silah keçirmək lazımdı.* S.Vəliyev; 2) tutmaq; 3) ixtiyarına keçirmək, sahib olmaq, mənimsəmək. **Ələ keçmək** – bax **ələ düşmək**. *O vaxt ki, azadlığın işartısı göründü; Qəlbimizi bir anda dəlib keçdi o bayraq; Qəlbimizdən boylanıb ələ keçdi o bayraq*. B.Vahabzadə. **Ələ öyrənmək** – əhliləşmək. **Ələ öyrətmək** – əhliləşdirmək. *Tülkü balasını ələ öyrətmək.* **Ələ salmaq** – 1) ələ keçirmək, əldə etmək, tapmaq. *Gəlmişdim bu Dərbənddə qalmağa; Bir tülək tərlanı ələ salmağa.* Aşıq Abbas; 2) *məc.* dolamaq, oynatmaq, masqara etmək, araya qoymaq. *Cəfər Quluya göz vurdu və Ocaqverdini ələ salmağa başladı.* Çəmənzəminli. *Əla salma daha bir bunca əvamı, mən ölüm; Nəql edib Rüstəmü Keykavusü Sami. mən ölüm.* Ə.Nəzmi. **Ələ tapşırmaq** – əmanət vermək, saxlamaq üçün vermək, təslim etmək. [Atabəy:] *Mən öz qəlbimi haman ələ tapşırmaq istəyirəm*. M.S.Ordubadi. **Ələ vermək** – təslim etmək, xəbər vermək, satmaq. *Yoldaşı ələ vermək.* – [Səlma:] *Sən bir qonaqsan, qatil olsan belə; Səlma həlak olur da, verməz ələ.* H.Cavid.

**Əl-əl gəzmək** – baxmaq, ya oxumaq üçün bir-birinə verilmək (çox bəyənilən şey haqqında). *Çəkdiyi rəsmlər əl-ələ gəzirdi. – Ustanın neçə həftəyə başa gətirdiyi başmaqlar məsciddə əl-əl gəzərdi.* Çəmənzəminli. **Əl-əl üstə dayanmaq** – hazır, amadə vəziyyətdə olmaq, hazır dayanmaq. *Qurbani .. baş əyib, xidmət məqamında əl-əl üstə dayandı.* (Nağıl). *Hər on-on beş addımda bir xidmətçi əl-əl üstə duraraq əmr gözləyir, gözlərini qonaqlardan çəkmirdi.* M.İbrahimov. **Əl-ələ vermək** – 1) bir-birinin əlini tutmaq. *Gəl verək əl-ələ, çıxaq bir bağa; Gül-gülə sarmaşır, budaq-budağa..* Aşıq Abbas. *Yox, yox, bu bayram günü gəlin verib əl-ələ; Yallı gedək bu gün biz.* B.Vahabzadə; 2) birgə, bir yerdə çalışmaq, bir iş görmək. *İkimiz əl-ələ verib istədiyimizə nail olacağıq.* (Qəzetlərdən). **Əl-ətək eləmək** *köhn.* – yalvarmaq, iltimas etmək. *Əmanətim budur*: *bir kənara çək; Yalvarıb, yapışıb elə əl-ətək...* Q.Zakir. **Əli (əlləri) sustalmaq** – həvəsdən düşmək, ümidsizliyə qapılmaq, ruhdan düşmək. **Əli altında olmaq** – yaxında hazır halda olmaq. *Kitablar hamısı əlimin altındadır.* **Əli aşağı düşmək** – yoxsullaşmaq, kasıblaşmaq. **Əli aşağı olmaq** – yoxsul, kasıb olmaq; maddi ehtiyac çəkmək. *Əli aşağı olmasaydı, bu il üzümlüyü bir az böyüdərdi.* Ə.Əbülhəsən. [Məşədi Məmməd:] *..Ay Səməd dayı, burada mən də bir işə girərdim. Yoxsa əlim çox aşağıdır.* B.Talıblı. *Eyibdir, bala, müdirimizə bədbəxtlik üz verib, əli aşağıdır, gərək ona kömək edək.* “Kirpi”. **Əli beldə** – lovğa-lovğa, əkə-əkə. **Əli bir yerə (işə) yetişmək** – müəyyən bir peşə, sənət, ixtisas sahibi olmaq, bir işdə işləmək. *..Qoy Fərhad qurtarıb gəlsin, əli bir yerə yetişsin, yəqin ki, məni bu halda qoymayacaq, mühəndis bir adama məni saxlamaq ağır olmaz.* C.Cabbarlı. **Əli boşa çıxmaq** – istədiyinə nail olmamaq, təşəbbüsü boşa çıxmaq, nəticəsiz qalmaq, heç bir şey əldə edə bilməmək. [Nəbi] *bir neçə adamdan borc pul istəyir, amma əli boşa çıxır.* “Qaçaq Nəbi”. **Əli çatmamaq** – vaxtı, macalı olmamaq, vaxt tapmamaq. *Əlim çatmır ki, bir sizə gəlim;* // görməmək, görüşə bilməmək, görməyə, görüşməyə vaxtı olmamaq. *..Əhməd də çox zaman şəhərdə və qəzada olur, Cəmilə əli çatmırdı.* Mir Cəlal. **Əli çıxmaq** – məhrum olmaq, əlində saxlaya bilməmək. *Kölgəyə uyma hirsü qəflətdən; Ta əlin çıxmasın həqiqətdən.* A.Səhhət. *Amma sözün doğrusu budur ki, dəxi mollaların məktəbindən əlim çıxandan sonra, əməlli-başlı müsəlman dərsi görmədim.* C.Məmmədquluzadə. [Bəhram:] *Maldan əlin çıxarsa, canın sağ olsun.* C.Cabbarlı. **Əli dinc oturmamaq** – 1) daim bir şeylə məşğul olmaq; 2) heç bir ehtiyac olmadan toxunmaq, əl vurmaq, toxunaraq, qurdalayaraq xarab etmək. **Əli əlinə dəymək** – əl verib görüşmək. *Mən bir qurban kəsərəm; Əli əlimə dəyəndə.* (Bayatı). **Əli əsmək (bir şeyin üstündə)** *məc.* – xəsislik etmək. **Əli gəlmək** – qıymaq, rəva görmək. **Əli gəlməmək** – qıymamaq, rəva görməmək. *Titrəyir, gecikir, əli gəlməyir; Bilməyir nə oyun hazırlar təqdir.* Şəhriyar. **Əli gətirmək** – çox qazanmaq; // oyunda bəxti gətirmək, dalbadal çoxlu udmaq. *Əli gətirmir ki, gətirmir.* – [Səlim bəy:] *Budur, bir neçə gündür əlim çox yaxşı gətirir.* Ə.Haqverdiyev. **Əli gicişmək** – 1) kimisə vurmaq istəmək, vurmağa bəhanə axtarmaq. *Əlim gicişir, durub döyəcəyəm ha!* 2) *zar.* əlinə pul gəlmək ehtimalı olmaq. **Əli iş tutan** – işləyən, işləyə bilən. *Əli iş tutanın hamısı buraya toplaşmışdı.* **Əli işdə olmaq** – işləmək, bir işlə məşğul olmaq. *Sənət məktəbini bitirən gündən əlim işdədir.* “Kirpi”. **Əli iti** – əldən çox cəld. [Aslan bəy:] [Aydəmir] *şeytan oğlu doğrudan igiddir, həm də əli itidir.* C.Cabbarlı. **Əli kəsilmək** – məhrum olmaq. **Əli qalxmaq** (adətən inkar formasında işlənir) – b a x **əli gəlmək**. [Pirverdi Camal bəyə:] *Üç min deyil, on min də olsa, heç kimin əli qalxmaz sizin canınıza qəsd etsin.* N.Vəzirov. **Əli qələm tutan** – savadlı, yaza bilən. *Məktəbin əli qələm tutanı Hidayətin və qəzetin başına toplandı.* Mir Cəlal. **Əli qələm tutmaq** – yazmağı bacarmaq, savadlı olmaq. **Əli qıymaq** – əli getmək, rəva görmək, əsirgəmək, qıymaq. *Əlim qıymır ki, bu ağacları kəsim.* **Əli qoynunda** – məyus, məəttəl, çarəsiz, naçar bir halda. *Əli qoynunda*

*durub baxır.* – [Pristav:] *Bu kasıb bədbəxtin öküzünü aparıbsan, binəvanı əli qoynunda qoyubsan.* Ə.Haqverdiyev. [Qızxanım] *gündüz axşama qədər və gecə sabaha qədər əli qoynunda, boynu çiynində oğlunun yanını kəsdirib oturur idi.* "Məktəb". **Əli silah tutan** – silah götürə bilən, silahdan istifadə edə bilən, vuruşa bilən. *Hər əli silah tutan aləmə ağalıq etmək istəyirdi.* Mir Cəlal. **Əli soyumaq** – işdən soyumaq, həvəsdən düşmək, ruhdan düşmək. **Əli təmiz olmaq** – işində düz olmaq, tapşırılan şeyə xəyanət etməmək. [Hacı Murad:] *İndi de görüm, əlin-zadın təmizdirmi?* S.S.Axundov. **Əli təmiz olmamaq** – arabir kiçik oğurluğa meyil etmək. **Əli titrəmək** – b a x **əli əsmək**. **Əli tutmaq** – b a x **əli gətirmək**. **Əli üzülmək** – ümidi kəsilmək, çarəsiz qalmaq, əli çıxmaq, məhrum olmaq. *Dağlar tutum dumanı; Yoxdu bircə umanı; Eldən əli üzülüb; Kimə getsin gümanı?* (Bayatı). **Əli varmaq** – b a x **əli gəlmək**. *Əlin necə vardı ki, bu işi sən gördün?* **Əli yetişmək (yetmək)** – çatmaq, nail olmaq. *Onu görmək istəyirəm, əlim yetişmir. – Uzaq düşüb, əlim yetməz; Həsrət qoyma yara məni.* Aşıq Abdulla. **Əli yüngül** – b a x **əliyüngül**. [Vaqif:] *Lələ, əlin yüngüldür, ağanın arxasınca su at, uzaq səfərə gedir.* Çəmənzəminli. **Əlim yaxanda olsun** – o dünyada mənə cavab verəsən (dini təbir). **Əlimin içindən (ortasından) gəlmək** – yaxşı eləmək, əcəb etmək (bir hərəkətə qarşı edilən etiraza qabacasına cavab). [Sənəm Güllüyə:] *Belə yaxşı eləyirəm, əlimin içindən gəlir, yazdırıram .. əlindən gələni beş qaba çək!* Ə.Haqverdiyev. **Əlində ölmək** – bilavasitə özünə baxan, xidmət edən adamın lap yanında, qabağında ölmək. **Əlində saxlamaq** – başqasına verməmək, əlindən verməmək, öz ixtiyarında saxlamaq, sahib olmaq. *Düşmən kəndi əlində saxlamaq üçün bütün qüvvətini sərf etdi.* M.S.Ordubadi. // Özünə tabe vəziyyətdə saxlamaq, əldə saxlamaq. **Əlindən (əlinizdən) gələni beş qaba çək (çəkin)** – hər nə bacarırsan (bacarırsınız) elə(yin), heç şeydən qorxmuram. **Əlindən almaq** – 1) birini bir şeydən məhrum etmək. *Hakimiyyəti burjuaziyanın əlindən almaq. İxtiyarı əlindən almaq. – Sənin kimi bacıoğlunu Allah Rəşidin əlindən alsın.* H.Nəzərli. *Aldı əldən əqlimi ahü nəvasi bülbülün; Huşu tarac etdi ləhni-dilrübası bülbülün.* Ə.Nəzmi; 2) zəbt etmək, zorla almaq. *Var-yoxunu əlindən almaq;* 3) başqasının şeyinə, malına və s.-yə zorla və ya başqa yolla sahib olmaq, mənimsəmək. *Aldadıban alar əlindən varın; Elə ki keyfincə saf gördü karın.* Q.Zakir; 4) məhrum etmək. *İndi* [Həzi Aslanov] *vəfat etmiş, ölüm əbədi olaraq onu bizim əlimizdən almışdır.* M.İbrahimov. **Əlindən çıxmaq** – 1) hazırlamaq, qayırmaq, hasil etmək. *Bu iş kimin əlindən çıxıb?* // Birinin rəhbərliyi altında hazırlanmaq, yetişmək, öyrənmək. *Usta əlindən çıxıb;* 2) itirmək, qeyb etmək, məhrum olmaq. **Əlindən dad çəkmək** – həddindən artıq narazılıq, şikayət bildirir. [Namaz:] *Camaat Həsənin əlindən dad çəkir.* Ə.Haqverdiyev. **Əlindən düşməmək** – həmişə əlində olmaq, yerə qoymamaq, heç vaxt ayrılmamaq (bir şeydən). *Atarsan, yıxarsan xeyli zamandı; Nə ox düşər, nə də kaman əlindən.* Q.Zakir. [Gəldiyevin] *düz on yeddi gün qələm, xətkeş, pərgar, rezin əlindən düşmədi.* Mir Cəlal. [Surxay Aydına:] *Əvvəlləri* [tar] *əlindən düşməzdi.* C.Cabbarlı. **...əlindən düşsün!** – qarğış ifadəsi kimi işlənir. **Əlindən getmək** – 1) əlindən çıxmaq, əldə saxlaya bilməmək. *Kamandan ox tükəndi; Əlimdən yay da getdi.* (Bayatı); 2) itirmək, qeyb etmək, yox olmaq, ölmək. [Həsən:] *İndicə bir nər kimi oğlu əlindən getdi.* H.Nəzərli. **Əlindən gələni etmək (eləmək)** – 1) mümkün olan hər bir şeyi etmək, özündən asılı olan hər tədbiri görmək. *..İşin mənafeyinə xidmət etmək üçün əlimizdən gələni edəcəyik;* 2) nə bacarırsa, hər nə pislik varsa etmək. [Hafizə xanım:] *Çor xanım, zəhrimar xanım, itil çölə.. Bəyin sağlığında əlindən gələni eləyib, indi məni də arvad görüb istəyir mənim başıma corab hörsün.* Ə.Haqverdiyev. **...əlindən gələr** – ...gözləmək olar (mənfi şəkildə). **Əlindən gəlmək** – bacarmaq, imkanı, iqtidarı olmaq. *Əlimdən gəlsəydi, edərdim.* – [Məşədi Həsən:] *Yəni özgələrə quyu qazmaq əlindən gəlirmi?* Ə.Haqverdiyev. [Qurbanəli:] *İgidin əlindən*

*hər şey gələr.* H.Nəzərli. *Müavin təbiəti yumşaq adam idi, rədd eləmək əlindən gəlməzdi.* Mir Cəlal. **Əlindən iş gələn** – bacarıqlı, işbilən, işbacaran, zirək. [Bədircahan bəyim:] *A kişi, adam gərək özünü aldatmasın.. Bu zəmanədə xan, bəy o adamdır, başında ağlı ola, cibində pulu, əlindən iş gələn ola.* N.Vəzirov. **Əlindən iş gəlməmək** – bacarmamaq, heç bir şey edə bilməmək, gücü çatmamaq, aciz olmaq. *Ögey atamın anamla rəftarını görüb, əlimdən bir iş gəlmədiyinə görə, biixtiyar ağlardım.* H.Sarabski. **Əlindən iş gəlməyən** – bacarıqsız, aciz, iş bacarmayan adam. *Əlindən iş gəlməyən çox danışan olar.* (Ata. sözü). **Əlindən qaçmaq** – yaxasını qurtarmaq, canını qurtarmağa çalışmaq. **Əlindən qurtarmaq** – 1) fəlakətdən, əziyyətdən, ölümdən qurtarmaq, nicat tapmaq. *Rəşidin əlindən ov qurtarmazdı.* H.Nəzərli; 2) xilas etmək, azad etmək, qurtarmaq. [Telli:] *Yaxşı ki qonaq gəldi, məni ağamın əlindən qurtardı..* Ü.Hacıbəyov. **Əlindən tutmaq** – birinə maddi kömək etmək, yardım əlini uzatmaq. *Əl tutanın əlindən tutarlar.* (Ata. sözü). [Məşədi Səttar:] *Əlində maya düzəltmək üçün qədim dost və aşnalarına yönəldi, heç kəs əl tutmadı.* Ə.Haqverdiyev. [Məşədi Qədim:] *Ay arvad, sənə də, mənə də övlad lazımdır ki, qocalanda əlimizdən tutan olsun.* T.Ş.Simurq. **Əlindən yapışmaq** – b a x **əlindən tutmaq. Əlindən zara gəlmək** – təngə gəlmək, cana gəlmək. **Əlində-ovcunda qalsın** – ölməsin, çox yaşasın. **Əlinə almaq** – b a x **ələ almaq**. *Məşhur mərhum xanəndə Hacı Hüsü də Məkkədən gələndən sonra əlinə qaval alıb xanəndəlik eyləyirdi.* Ə.Haqverdiyev. **Əlinə çöp vermək** – aldadıb yola salmaq, başından etmək. *Bizim uşaqlar söhbət arasında deyirdilər ki, "filankəsin əlinə çöp verdilər, getdi".* "Kirpi". **Əlinə düşmək** – girinə keçmək. [Məşədi Həsən:] *Xudanəkərdə, Hacı Seyid Ağabalanın əlinə düşərsən, evin yıxılar.* Ə.Haqverdiyev. [Nadir:] *Sizi and verirəm Allaha, gedib vaxt var ikən bir tərəfdə gizlənəsiniz ki, məndən sonra zalımlar əlinə düşməyəsiniz.* C.Cabbarlı. **Əlinə salmaq** – əldə etmək, tapmaq, ələ keçirmək, ələ gətirmək. [Hacı Murad:] *Qırx il külüng çalıb bir cüzi pul əlimə salmışam.* S.S.Axundov. **Əlini (əllərini) ölçmək** – əllərini oynada-oynada, həyəcanla danışmaq. *Əlini ölçməyinə baxma, iş bacaran deyil.* **...əlini öpür** *məc.* – əlindən gəlir. *Pis işlər həmişə onun əlini öpür.* **Əlini ağdan qaraya vurmamaq** – heç bir iş görməmək, bikar durmaq. *..Neçə yüz adam əlini ağdan qaraya vurmayıb, müftə dolanır.* N.Vəzirov. [Şəkinski:] *Baxın, deyirəm sizə, bundan sonra hər yetən gəlib yenə bir ağa olacaqsa, mən əlimi ağdan qaraya vurmaram.* C.Cabbarlı. **Əlini başına çırpmaq (vurmaq)** – təəccüblənmək, təəssüflənmək. **Əlini bənd etmək** – bir işdən yapışmaq. **Əlini dizinə vurmaq (çırpmaq)** – təəccüblənmək, təəssüflənmək. *Əlini vurub dizinə, indi gəlib özünə.* (Ata. sözü). **Əlini əlinə vermək** – vüsala çatdırmaq, görüşdürmək, birləşdirmək, qovuşdurmaq. [Qarı:] *Qorxma, oğlan, verrəm əlin əlinə; Eşitdiyin şəhri-Tiflis buradır.* "Aşıq Qərib". **Əlini əlinin üstünə qoymaq** – bikar, işsiz oturmaq, heç bir iş görməmək. **Əlini gözünün üstünə qoymaq** – bu hərəkətlə tapşırılan bir işi yerinə yetirəcəyinə söz verdiyini, hazır olduğunu bildirmək. **Əlini kəsmək** – ümidini üzmək, əlini çəkmək. **Əlini qulağının dibinə qoymaq** – oxumaq (hava ilə). [Əhməd:] ..[Əntiqə] *əlini ki qulağının dibinə qoydu, zalım qızı lap möcüz görsədir.* Mir Cəlal. **Əlinin dalını yerə qoymaq** – 1) tabe olmaq, təslim olmaq, məğlub olduğunu etiraf etmək; 2) tabe etmək, məğlub etmək. **Əlinin içi gicişmək** *zar.* – b a x **əli gicişmək** 2-ci mənada. *Əlimin içi gicişir deyəsən, əlimə pul gələcək.* **Əlinin suyu** – qüvvəti, gücü, zülmü. *Əlinin suyunu heç kəs görməsin!* **Əllər yuxarı!** – b a x **əllərini qaldır! Əlləri dalında** – əllərini dal tərəfdə bir-birinə çatmış halda. *Əlləri dalında gəzinir.* **Əlləri qızıldır** – mahir usta, sənətkar haqqında. **Əlləri yanına sallanmaq** – məyus olmaq, ruhdan düşmək, ümidsiz olmaq. **Əllərini daraqlamaq** – əl barmaqlarını bir-birinə keçirmək. **Əllərini düyünləmək** – əllərinin barmaqlarını bir-birinə keçirərək düyün halına gətirmək. *..Alagöz tir-tir titrəyib əllərini*

*düyünlədi.* S.Rəhimov. **Əllərini görmək olmamaq** – çox sürətlə işləmək. [Qızlar] *pambığı elə sürətlə yığırdılar ki, əllərini görmək olmurdu.* (Qəzetlərdən). **Əllərini işə salmaq** – 1) əlləri ilə işləməyə, bir iş görməyə başlamaq; 2) əlləri ilə vurmağa, dalaşmağa başlamaq, fiziki qüvvəyə əl atmaq. **Əllərini qaldırmaq** – təslim olmaq. **Əllərini ölçmək** – danışarkən əl(lər)ini oynatmaq, tərpətmək. *Əllərini ölçə-ölçə danışmaq.* **Əllərini öpür** (adətən cəm şəklində) – hazırdır. **...əlini(zi) çək(in)!** – başqasının daxili işinə qarışmamağı, başqasına toxunmamağı tələb edən nida. **Əllərini yana salmaq** – ayaq üstə sakit, hərəkətsiz durmaq; qımıldanmamaq. **Bir əldə (olmaq)** – bir adamın ixtiyarında, bir adamda, bir şəxsdə (olmaq). **Bir əldə iki qarpız tutmaq** – eyni vaxtda bir neçə işdən yapışmaq, yaxud bir neçə məqsədi əldə etməyə çalışmaq. **Dörd əl** *mus.* – iki adam tərəfindən piano çalma üsulu. **Dörd əllə** – b a x **dördəlli**.

**ƏLA** *sif.* [*ər.*] 1. Ən yüksək, ən yaxşı, ən gözəl. *Əla meyvə. Əla şey.* – [Qərib:] *Yarın eyvanında cüt qoşa qızla; Şahsənəm əladır, hamısı gözəl.* "Aşıq Qərib". *Həmin bu yetər ki, desən; Qullarımdan əladır bu.* Q.Zakir. *Leylinin bir lətafəti yoxdur; Ondan əla gözəl sənəm çoxdur.* S.Ə.Şirvani. // Tələbələrin biliyinə verilən ən yüksək qiymət. *Əlaya layiq cavab verdi. Kimyadan əla qiymət aldı.* // Zərf mənasında. *Əla oxumaq. Tapşırığı əla yerinə yetirmək. Vəzifəsini əla başa düşür. – Şiraslan, yoldaşları arasında əla qiymətlə oxuduğu üçün seçilir, divar qəzetində onun kiçik şeirləri də çıxırdı...* S.Rəhimov. *Əla oxuyan, hörmət qazanan bir tələbəyə nə ad qoyub, nə qara yaxasan?* Mir Cəlal.

2. *klas.* Daha hündür, daha uca, daha yüksək. *Camalın şöləsi günəşdən əla; Səni görən necə olmaz mübtəla.* Sarı Aşıq. // Keyfiyyətcə ən yaxşı, yüksək. *Əla növ.* – [Hacı] *İtotaran Daşdəmirin oğlu Naqqal Feyzulladan iki kisə də əla xına alıb evə qayıtdı.* H.Sarabski. *Stolların üstünə o qədər də əla olmayan qırmızı mahuddan örtük çəkilmişdi.* M.İbrahimov.

**ƏLAC** *is.* [*ər.*] 1. Bir xəstəliyin sağalmasına kömək edən hər bir şey; dərman, dava. *Hazır əlaclar var. – Firuzə xəstəni bir an gözdən qoymurdu, həkimin yazdığı əlacı vaxtlı-vaxtında içirir və üstündə gecə-gündüz yarpaq kimi titrəyirdi.* A.Şaiq. [Sadıq kişi:] *Ay usta Hüseyn, bizim Məmmədvəlinin burnu qanıyıb, nə əlac edirik, qan kəsilmək bilmir.* C.Məmmədquluzadə.

2. Tədbir; vasitə. *Bu işi yoluna qoymaq üçün bir əlac axtarmalı. – Der: – Qanda bulum əlacın, ey yar? Kimdən yetə ehtiyacın, ey yar?* Xətayi. // Çarə. [Ağa Kərim xan:] *İt hürdükcə qaçıram bağa, əlac nədi, qorxuram.* N.Vəzirov. ◻ **Əlac etmək** – müalicə etmək, sağaltmağa çalışmaq. **Əlac vermək (etmək, tapmaq)** – vəziyyətdən qurtarmaq, çıxış yolu tapmaq (göstərmək), çarə tapmaq. [Aslan:] *Yox, böylə deyil, buna bir əlac tapmalıyıq.* İ.Musabəyov. [Birinci kəndli:] *Əlac elə, aşağı bağlar əldən getdi.* H.Nəzərli. *Bəlkə tez gələsən, əlac verəsən; Sünbülün saçını yığıb hörəsən.* N.Rəfibəyli. **Əlacı kəsilmək (üzülmək)** – çarəsi kəsilmək, çarəsiz qalmaq. *Nə qədər güc vurdu, götürmədi əl; Kəsildi əlacı, qaldı məəttəl.* Q.Zakir. *Əlacım hər tərəfdən kəsildi, bir təbəqə kağızı qoydum qabağıma, dedim, indi söylə, mən yazım.* Qantəmir.

**ƏLACLI** *sif.* Əlacı, dərmanı olan, sağala (sağaldıla) bilən, müalicəsi olan.

**ƏLACPƏZİR** *sif.* [*ər.* ilac və *fars.* ...pəzir] Əlacı (dərmanı) olan, sağala (sağaldıla) bilən, müalicəsi olan. *Ustanın azarı əlacpəzir deyildi.* Çəmənzəminli.

**ƏLACPƏZİRLİK** *is.* Əlacı, dərmanı olma; sağala (sağaldıla) bilmə. *Xəstəliyin əlacpəzirliyi.*

**ƏLACSIZ** 1. *sif.* Davasız, dərmansız, sağalmaz, əlacı olmayan. *Əlacsız xəstəlik sağalmaz. Əlacsız dərdə düşmək. – Gah sələmə pul verdi, bəzən də dərman satdı; Əlasız xəstələri min kələklə aldatdı.* N.Rəfibəyli.

2. *zərf* Çarəsiz, imkansız. *Çıxılmaz vəziyyətdə əlacsız qalmaq. Əlacsız olmaq. – ..Əlacsız qalıb mən alacəhrəni çıxarıb ona göstərdim və nə üsul ilə tutduğumu söylədim.* S.S.Axundov. [Tapdıq] *əlacsız qalıb, içəridən sınıq maşını götürüb məşğul olmaq istədi.* Ə.Vəliyev. *Heç yerdə ədalət buradakı qədər gücsüz, əlacsız olmamışdı.* Mir Cəlal.

**ƏLACSIZLIQ** *is.* Çarəsizlik, naəlaclıq. *Pərşan .. yorulub əlacsızlıqdan* (z.) "*Aşıq Ələsgər"i götürdü, vərəqlədi.* M.İbrahimov.

**ƏLAÇI** *sif.* 1. Bütün fənlərdən əla qiymət alan. *Əlaçı tələbə. – Şirmayı əlaçı şagirdlərdən biri idi.* M.Hüseyn. *Əlaçı qız Aybəniz; Lövhəyə çağırılır.* M.Seyidzadə. // İs. mənasında. *Əlaçıların şəkilləri divar qəzetində çıxmışdır.*

2. Öz vəzifəsini, işini əla yerinə yetirən. *Əlaçı şofer. Əlaçı satıcı.* // İs. mənasında. *İstehsalat əlaçıları.*

**ƏLAÇILIQ** *is.* Əla qiymətlə oxuma, bütün dərslərdən əla qiymət alma. *Əlaçılıq uğrunda mübarizə. –* [Ceyran] *öz sinfinin əlaçılığı uğrunda əlləşirdi.* S.Rəhimov.

**ƏLAHƏZRƏT** *sif.* və *is.* [*ər.*] *köhn.* Padşahların və onların arvadlarının titulu. [Atabəy:] *Mənim özüm də əlahəzrəti ziyarət etməyi düşünürdüm.* M.S.Ordubadi.

**ƏLAHİDDƏ** [*ər.*] 1. *sif.* Ayrı, başqa. *Əlahiddə məsələ. Əlahiddə şəkil. –* [Hacı Qara] *üç yüz qızıl sanayıb əlahiddə kisələrə qoyur, sonra gedir, tüfəng, tapançasını, xəncərini, qılıncını gətirir.* M.F.Axundzadə. *Məşədi Əsgər çamadanı yerdə görcək daha əlahiddə fikir başına gətirməyib, ancaq onu bildi ki, götürüb qaçmaq üçün əsil fürsət məqamıdır.* S.M.Qənizadə.

2. *zərf* Ayrıca, xüsusi. *Əlahiddə yaşamaq. Əlahiddə çalışır. Bu qürbət şəhərdə hərbi xidmətdə olan bir neçə yoldaşla bərabər əlahiddə bir evdə yaşayırdıq...* Ə.Məmmədxanlı.

3. *sif.* Xüsusi. *..O, mart ayının axırlarında Təbrizə gələcəyini yazmış və sizə əlahiddə salam göndərmişdir.* M.S.Ordubadi.

**ƏLAHİDDƏLƏŞMƏ** "Əlahiddələşmək"-dən *f.is.*

**ƏLAHİDDƏLƏŞMƏK** *f.* Bir şeydən ayrılaraq xüsusi şəklə düşmək, xüsusiləşmək.

**ƏLAHİDDƏLİK** *is.* Ayrılıq, xüsusilik.

**ƏLAQƏ** *is.* [*ər.*] 1. Qarşılıqlı münasibət, bir-biri ilə bağlılıq. *Sənaye ilə kənd təsərrüfatı arasında əlaqə. Elmlə praktika arasında əlaqə. Ticarət əlaqələri. Beynəlxalq əlaqələrin möhkəmlənməsi. Qohumluq əlaqəsi.* // Qarşılıqlı asılılıq, bir-birindən asılı olma. *Səbəbiyyət əlaqəsi. Elmlərin bir-biri ilə əlaqəsi.* // Sıx münasibət, yaxınlıq, bağlılıq. *Dostluq əlaqəsi. Əlaqəsini kəsmək. Onlarla mənim heç bir əlaqəm yoxdur.* // Ünsiyyət. *Dil insanlar arasında əlaqə vasitəsidir.*

2. Münasibət. *Aralarında səmimi əlaqə var. – Onların qadına qarşı əlaqələrindəki mehribanlığı xoşlayırdı.* M.İbrahimov. [Dilbər:] *Sevgilisini görmüş və öz əlaqəsini bildirmişdi.* Ə.Sadıq.

3. Sevgi, ürək bağlılığı, məhəbbət. *Qətibə bu əlaqənin başlanmasını öz məqsədinə uyğun bilirdi.* M.S.Ordubadi.

4. Cinsi yaxınlıq, müaşiqə.

5. Yaxın tanışlıq, dostluq, yaxınlıq. *Musiqi aləmi ilə onun yaxın əlaqəsi vardır. –* [Mehriban] *bu vaxtadək kimsənin qarşısında boyun əyməmişdi. İndi onu sevmək istəməyən bir adamla əlaqəsi necə ola bilərdi?!* S.Hüseyn.

6. Rabitə, rabitə vasitəsi. *Canlı əlaqə. – Kərim radio vasitəsilə sahillə əlaqəyə girdi.* M.İbrahimov. *Əlaqə tezliklə bərpa edilməli idi.* Ə.Əbülhəsən.

7. Maraq, münasibət. *Əlaqə göstərmək. Əlaqə oyandırmaq. –* ..[Səlimi] *tərpənmir, danışmır, əlaqəsini bildirmir, heç bir şey ifadə etməyən gözləri ilə* [Hikmət İsfəhaninin və İranpərəstin] *bütün hərəkətlərini izləyirdi.* M.İbrahimov.

8. İştirak, hissəsi olma, payı olma, aidiyyəti olma. *Kitabın tərtibində onun da əlaqəsi var.*

9. Dəxli olma, münasibəti olma; aidiyyət. [Yaşlı kişi:] *Hərəmxana ilə heç bir əlaqəsi olmayan bu otaqların ancaq birisinin qapısı vardı.* S.Hüseyn.

**ƏLAQƏÇİ** *is.* Qoşun hissələrində əlaqə xidməti görən əsgər və ya zabit.

**ƏLAQƏDAR** *sif.* [*ər.* əlaqə və *fars* ...dar] 1. Əlaqəsi, münasibəti, bağlılığı olan; bağlı. *Dərs ilinin başlanması ilə əlaqədar tədbirlər. Hazırlıq işləri ilə əlaqədar məsələlər. – Yəqin bu məsələ onun dalğınlığı ilə də əlaqədardır.* A.Şaiq. *Əbil ötən günlərin həsrətini çəkmirdi, onun keçmişlə əlaqədar heç nəyi yox idi.* Ə.Vəliyev. *Qədir kişi bu hörmətlərdən darıxmır, bunu özünün yaxşı işləməsi ilə əlaqədar bilirdi.* Ə.Sadıq. // Aidiyyəti olan. *Əlaqədar təşkilatlar.*

2. İştirakı olan, hissəsi olan. *Kitabın tərtibində üç müəllif əlaqədardır.*

◊ **...əlaqədar olaraq** – ...nəticəsində, ...görə, ...münasibəti ilə, ...bağlı olaraq, ...müvafiq olaraq. *Qatarın gecikməsi ilə əlaqədar olaraq, müşavirəyə vaxtında çata bilmədim. Qərarla əlaqədar olaraq, böyük hazırlıq işləri görülmüşdür. Bu məsələ ilə əlaqədar olaraq, qarşıya ciddi vəzifələr çıxır.*

**ƏLAQƏDARLIQ** *is.* Bağlılıq, asılılıq; qarşılıqlı əlaqə.

**ƏLAQƏLƏNDİRİLMƏ** "Əlaqələndirilmək"dən *f.is.*

**ƏLAQƏLƏNDİRİLMƏK** *məch.* Bir-biri ilə sıx surətdə bağlanmaq, aralarında əlaqə, rabitə, münasibət, uyğunluq yaradılmaq, əlaqədar edilmək, uzlaşdırılmaq. *Bu proqramlar və dərsliklərin bəzisi təcrübə ilə əlaqələndirilmişdir.*

**ƏLAQƏLƏNDİRMƏ** "Əlaqələndirmək"dən *f.is.*

**ƏLAQƏLƏNDİRMƏK** *f.* Əlaqədar etmək, bir-biri ilə bağlamaq, aralarında əlaqə, münasibət, rabitə, uyğunluq yaratmaq; uzlaşdırmaq; bir-biri ilə əlaqədar halda göstərmək. *Mühazirələrdə gətirilən faktik materialları* (*bugünkü*) *həyatla əlaqələndirmək lazımdır.*

**ƏLAQƏLƏNMƏ** "Əlaqələnmək"dən *f.is.*

**ƏLAQƏLƏNMƏK** *f.* Əlaqədar edilmək (olunmaq), uzlaşdırılmaq. *Sözlər bir-biri ilə əlaqələnmirdi.*

**ƏLAQƏLİ** *sif.* 1. Əlaqəsi olan, əlaqədar, bir-biri ilə bağlı, asılı. *Əlaqəli məsələlər.*

2. Asılı, bir-birindən asılı, bir-birinə tabe. *Şöbələr müəssisənin ümumi idarəsi ilə əlaqəlidir.*

**ƏLAQƏLİLİK** *is.* Bir-biri ilə sıx bağlılıq, bir-birindən asılılıq.

**ƏLAQƏSİZ** *sif.* 1. Aralarında əlaqə, rabitə, asılılıq, bağlılıq, münasibət olmayan; rabitəsiz.

2. Maraq və əlaqə göstərməyən, əhəmiyyət verməyən, fikir verməyən; laqeyd. *Məsələyə əlaqəsiz* (z.) *yanaşmaq.*

**ƏLAQƏSİZLİK** *is.* Arada əlaqə, rabitə, ünsiyyət, münasibət olmaması; maraqsızlıq. *Əlaqəsizlik göstərmək* (*maraqlanmamaq, maraq göstərməmək*).

**ƏLALIQ** *is.* Əla şeyin hal və keyfiyyəti; çox yüksəklik. *Görməmişsənmi mənim təbimin əlalığını; Çox mənim ilə keçib sübhilə şamın, Yusif!* Aşıq Qədir.

**ƏLALTI** 1. *sif.* və *is.* Əl altında işləyən, köməkçi işləri görən, köməkçi. *Əlaltı fəhlə. Usta əlaltısı. Bənna əlaltısı.* – [Səkinə:] *..Aylarla .. buruqda rəhmətlik atasının əlaltısı olub.* M.İbrahimov.

2. *zərf* Xəlvəti, gizlicə, heç kəsin xəbəri olmadan, əl altından. *Əlaltı xəbər göndərmək.* – [Xəlil paşa] *özü də əlaltı tədarük görüb qoşun-zad hazırladı.* "Koroğlu". *Tarverdinin bu hərəkəti, əlaltı öküzləri satıb yeməyi təlimatçı Məcidi pərt eləmişdi.* S.Rəhimov.

3. *is. məc.* Başqasının göstərişi və ya rəhbərliyi ilə işləyən, iş görən adam; köməkçi. *Getdikcə dostlar üz döndərir, tərəfdar azalır, əlaltıları da* [Hümməti] *eşitmək istəmirdilər.* B.Bayramov.

4. *is.* Kart və başqa oyunlarda: hazırda oynayan adamdan sonrakı birinci adam.

**ƏLALTINCA** bax **əlalt(ın)dan**. *Sofulu Hacı İsmayıl Nəbinin gəldiyini eşidib əlaltınca pristava xəbər verdi.* "Qaçaq Nəbi".

**ƏLALT(IN)DAN** bax **əlaltı** 2-ci mənada. *Əlaltından işləmək. Əlaltından xəbər vermək.* – [Turac:] *Demək, özünə əlaltından cehiz düzəltdirmisən?* İ.Əfəndiyev. *Ana və qayınana əlaltından Zöhrəni bir çox arvadlara göstərdilər.* Ə.Vəliyev.

**ƏLAMAN** [*ər.*] 1. Yardıma, imdada, köməyə çağırış bildirən nida. *Əlaman, qurd inəyi dağıtdı! – Nə qəflətdir bu səndə, ey sitəmgər, cövrü zülmündən; Sərasər yer üzünü sövtü sədayi-əlaman tutmuş.* Q.Zakir. *Arqadaşlar, əlaman, gəl tez verib də əl-ələ; Həm bu yolda əhdü peyman etməli bundan sora!* M.Ə.Sabir. *Şikəstə Hamidəm, canan; Dərdindən öldüm, əlaman!* Aşıq Hamid. // Yalvarış bildirir. *Boyum bərabərisən indi, əlaman, getmə!* X.Natəvan. // Şikayət bildirir. *Əlaman durnalardan; Qaç yaman durnalardan; Tutaram sorağını; Hər zaman durnalardan.* (Bayatı). *İsmət, həya, ədəb gedəcək əldən, əlaman!* Ə.Nəzmi.

2. *is.* İmdad, nicat. *Təsəvvür etmə fəğanım həlaki-candandır; Kəman öpər əlüvi, əlamanım ondandır.* S.Ə.Şirvani.

◊ **Əlamanda olmaq (qalmaq)** – çarəsiz qalmaq, nə edəcəyini bilməmək, çətin, çıxılmaz vəziyyətdə olmaq. *..O bədbəxt .. bizdən üz döndərib, qalmışıq əlamanda.* N.Vəzirov. *..Ələmdar yerindən tərpənib əlamanda olan ağasının yanına gəldi.* S.Rəhimov.

**ƏLA-MƏRƏKƏ** bax **əla** 1-ci mənada. [Qoltuqçu:] *Lap əla-mərəkədir.* S.Rəhimov.

**ƏLAMƏT** *is.* [*ər.*] 1. Bir şeyin bilinməsinə, müəyyən edilməsinə vasitə olan nişanə; işarə. *Xəstəliyin əlamətləri. Baharın əlamətləri. – Bütün günü Fəxrəddinin xəfiyyələri saray ətrafında gəzib müəyyən əlamətləri daşıyan qadının intizarını çəkirdilər.* M.S.Ordubadi. [Oğlan] *bütün zahiri əlamətlərinə: gözlərinin rəngi, üzünün cizgilərinə görə rus idi.* M.Rzaquluzadə.

2. İz, əsər, qalıq. *Qədim zamanda Azərbaycanda şüşəçilik sənətinin tərəqqi etdiyini göstərən bir çox tarixi əlamətlər var. – Qırx gün, qırx gecə Usta Ağabala yol getdi, ətrafda bir işıq əlaməti görmədi, axırda təngə gəlib bir daşın ətəyində uzandı.* Çəmənzəminli. *İlk baxışda bu şəhərdə həyat əlaməti görünmürdü.* M.Hüseyn. *Ərdəbildə baş vermiş hadisələr üçün Firidunun və ya başqa bir adamın tutulduğunu bildirən heç bir əlamət yox idi.* M.İbrahimov.

3. *məc.* Rəmz, ifadə, işarə. *Katib Kosanın sifətində bədbəxtliyi xəbər verən bir əlamət olduğunu mülahizə edərək qorxuya düşdü və yerindən ayağa qalxdı.* S.Rəhimov. [Qədir] *özünün adamlardan seçilməsini böyüklük əlaməti sayırdı.* Mir Cəlal. [Oğlan] *yəqin mənim üzümdə heyrət əlaməti görüb əlavə etdi.* M.Rzaquluzadə.

4. *məc. dan.* Görünməmiş, fövqəladə, tayıbərabəri olmayan şey haqqında. *Hər aşiqin bir yarı var; Əlamətdi mənim yarım.* Q.Zakir. *Qaşların əlamət, gözün afatdı; Alışdırdı canım, odlara çatdı.* Aşıq Novrəs.

◊ **Əlaməti-fariqə** *köhn.* – bir şeyi başqalarından fərqləndirən əlamət.

**ƏLAMƏTDAR** *sif.* [*ər.* əlamət və *fars.* ...dar] Öz əhəmiyyətinə görə görkəmli, çox böyük əhəmiyyəti olan. *Əlamətdar tarix. Əlamətdar hadisə. Əlamətdar gün.* – [Şamamanın] *təbiətindəki yaxşı, əlamətdar keyfiyyətlərin meydana çıxmasına, ümumun mənafeyi üçün fövqəladə dərəcədə xeyirli olmasına xalq kömək edir.* İ.Əfəndiyev.

**ƏLAMƏTDARLIQ** *is.* Əlamətdar olma, çox əhəmiyyətlilik. *Hadisənin əlamətdarlığı.*

**ƏLAN** *zərf* [*ər.*] 1. Bu an, indi, hala. *Ürəfa məskəni olan Şirvan; Cühəla xabgahıdır əlan.* M.Ə.Sabir. [Şeyx Hadi:] *Mən də yoldaşlarımla bir yandan; Hində əzm etmək üzrəyəm əlan.* H.Cavid.

2. Hələ də, indiki halda. *Əlan buradadır, getməmişdir. – Mədənlər yavrusu cəsur bir insan; Yerindən sıçrayıb danışır əlan.* S.Vurğun.

**ƏLAVƏ** [*ər.*] 1. *sif.* Əsas şeyin üstünə artırılan; üstəlik. *Əlavə xərc. Əlavə seans. Bu gün iki əlavə dərs oxuduq. Əlavə vaxt vermək lazımdır. – Məncə, bu .. otağa əlavə bir qapı açmaq lazımdır.* M.S.Ordubadi. *Cavanları tərbiyələndirmək, onları ölkə üçün yetişdirib boya-başa çatdırmaq əlavə diqqət və qayğı tələb edirdi.* M.Hüseyn. ☐ **Əlavə etmək** – üstünə artırmaq, qoymaq. *Məbləğin üstünə iki manat əlavə etmək. Çaya qənd əlavə etmək;* // üstəlik olaraq demək və ya yazmaq. *Məktuba bir neçə söz əlavə etdi. Mən bu gündən işə başlayacağam, – deyə əlavə etdi. – Zeynal əlavə etdi: – Biz bundan sonra bir damın altında bərabər yaşaya bilməyəcəyik.* S.Hüseyn. *Sonra əlavə etdi: – Mən bu səsi eşitməyi çox xoşlayıram.* M.Rzaquluzadə. **Əlavə olaraq** – üstəlik olaraq, əlavə kimi, əlavə şəklində. [Mirzə Qədir] *öz istirahətini pozub otaqların birini də verməli, əlavə olaraq* [Nəsirə] *ailəsini keçindirə biləcək bir maaş da təyin etməli idi.* S.Hüseyn. [Usta Qəzənfər:] *Dəniz neftçiləri .. əlavə olaraq dövlətə tonlarla neft veriblər.* Z.Xəlil. **Əlavə olunmaq** – üstəlik artmaq. [Onu] *əridən araqla papiros idi. Son günlərdə qorxu da əlavə olunmuşdu.* Ə.Vəliyev.

2. *is.* Kitaba, ayrı-ayrı fəsillərə, yazıya və s.-yə artırılan hissə, bəhs və s. *Kitabın axırında əlavəsi var. Dissertasiyanın hər fəslinə əlavə verilmişdir. – Xoşqədəm çay süzürdü. Mən əlavələrin yerini müəyyənləşdirirdim.* Ə.Vəliyev.

3. *is.* Məcmuə və ya qəzet abunəçilərinə artıq, üstəlik olaraq göndərilən kitabça və s.

4. *Qoş. mənasında*: ...başqa. *İş bilməyən, ancaq yemək-içməkdən əlavə; Bu canlı dəyirmanlarına şükr, xudaya!* M.Ə.Sabir. *Əlavə, Haşımdan başqa onların bir köməyi yox idi.* B.Talıblı. □ **Bundan əlavə –** bundan başqa, üstəlik olaraq. *Bundan əlavə, dəxi Yusif şahda həzar gunə özgə eyblər tapdılar.* M.F.Axundzadə. *Bundan əlavə, Qaraca qız özü də oynamağı tərk etmişdi.* S.S.Axundov.

5. Xüsusi terminologiyada: artım, törəmə, bir maddənin, məhlulun və s.-nin tərkibinə, üstünə əlavə edilən maddə və s. *Dizel yanacaqlarına başqa əlavələr qatılır.*

**ƏLAVƏSİZ** *sif.* Əlavəsi olmayan, əlavə verilməyən. *Əlavəsiz məcmuə* (*qəzet*).

**ƏL-AYAQ** *top.* Qollar ilə qılçalar birlikdə. *Əl-ayağını bağlamaq. Əl-ayağı titrəmək* (*əsmək*). – [Köməkçi dedi:] *Səriyin əl-ayağını, sürün onu bəri... Nə olubdur?* C.Cabbarlı. *Hatəmxan evin yerindən tərpənmir, Pası əl-ayağını uzadır və onu yerə çırpırdı.* S.Rəhimov.

◊ **Əl-ayağa dolaşmaq** – mane olmaq, ayağa dolaşmaq. *Uşaqları aparın, yoxsa əl-ayağa dolaşarlar.* – [Yaşlı kişi:] *Şoğəribə qalmış əl-ayağına dolaşır, – deyərək* [Şirinnazın] *çarşabını başından alıb yerə atdı.* S.Hüseyn. [Hakim] *səliqəli stolunun üstündə gördüyü lazımsız kağızları bir-bir cırıb səbətə atırdı ki, "əl-ayağa dolaşmasın!"* Mir Cəlal. **Əl-ayağa düşmək** – tələşa düşmək, təşvişə düşmək, həyəcanlanmaq. *Mehdinin qaçmasını Naxçıvan və Gorus nəçənniklərinə xəbər verdilər. Nəçənniklər əl-ayağa düşdülər.* "Qaçaq Nəbi". *Adamlar əl-ayağa düşdülər. İskəndər kişinin cənazəsini samanlığa apardılar.* M.Hüseyn. [Nəcəf:] *Bəs sən niyə belə əl-ayağa düşmüsən?* İ.Əfəndiyev. **Əl-ayağı buza dönmək (soyumaq)** – əlləri və ayaqları soyumaq, soyuqdan donmaq. *Tahirin anası Gülsənəm arvad qaş qaralanda fermada sağını qurtarıb evə qayıdan zaman onun yanaqları gömgöy olmuş, əl-ayağı buza dönmüş, az qala dili tutulmuşdu.* M.Hüseyn. **Əl-ayağı düz** – tərbiyəli, əxlaqlı, ismətli. *Anam, bacım, qız gəlin; Əl-ayağı düz gəlin; Yeddi oğul istərəm; Bircə dənə qız, gəlin.* (Bayatı). **Əl-ayağı soyumaq** – 1) ölümü yaxınlaşmaq, ölmək; 2) həvəsdən düşmək, ruhdan düşmək. *Lotuların əl-ayağı işdən-gücdən soyudu...* (Nağıl). **Əl-ayağı sustalmaq** – 1) zəifləmək, taqətsizləşmək. *Yavaş-yavaş qulağıma tarqaval səsləri də gəlməyə başladı. Əlim-ayağım sustaldı.* M.Rzaquluzadə; 2) b a x **əl-ayağı soyumaq. Əl-ayağı titrəmək** – 1) qorxudan və ya soyuqdan əsmək, titrəmək; 2) zəiflik, qocalıq, xəstəlik üzündən əl və ayaqları əsmək. **Əl-ayağı üzülmək –** b a x **əli üzülmək** ("**əl**"də). **Əl-ayağı yerdən üzülmək** – son dərəcə təəccüblənmək, heyrət etmək. *Muxtarov Xanlara baxdıqca özü də məəttəl qalır, bəzən elə bil əl-ayağı yerdən üzülürdü.* M.Hüseyn. **Əl-ayağına düşmək** – təzim etmək, qabağında diz çökmək, yalvarmaq. **Əl-ayağını bağlamaq** – hərəkət etməsinə imkan verməmək, mane olmaq. **Əl-ayağını kəsmək** – heç bir iş görməyə qoymamaq, mane olmaq. **Əl-ayağını qayırmaq** – hazırlaşdırmaq, hazırlıq görmək. [Hacı Həsən:] *Ay qız, Fatma, Nazlının əl-ayağını qayır, bu gün gərək köçürək.* C.Məmmədquluzadə. **Əl-ayağını toplamaq** – 1) işə başlamaq, nədən başlamaq lazım gəldiyini müəyyən etmək. *Çimnaz isə hələ də əl-ayağını toplaya bilmirdi.* Ə.Əbülhəsən; 2) işi qurtarmaq üzrə olmaq, işi tamamlamağa yaxınlaşmaq. **Əl-ayağını yığ(ışdır)maq** – nizam və intizama tabe etmək, tabe olmağa məcbur etmək, qabağını almaq, istədiyini etməyə qoymamaq, müəyyən çərçivə içərisinə almaq. **Əl-ayaq açmaq** – istədiyi kimi, sərbəst hərəkət etmək. **Əl-ayaq atmaq** – b a x **əl-ayaq çalmaq. Əl-ayaq çalmaq** – çırpınmaq, çapalamaq. **Əl-ayaq çəkilmək** – b a x **əl-ayaq yığılmaq**. ..*Gecə yarısı əl-ayaq çəkilir, hər şey yuxuya gedir, səs-səda kəsilir.* M.S.Ordubadi. *Axşam əl-ayaq çəkiləndə bura gəlib, üzünü bu qayaya tutub "a qaya-qaya!" deyə çağırsan, "qaya-qaya!" deyən əks-səda eşidərsən.* R.Rza. *Çünki elə hər gecə, çəkiləndə əl-ayaq; Qaranlıq döngələrdə onlar verir səs-səsə!* Ə.Cəmil. **Əl-ayaq eləmək (etmək)** – 1) tərpənmək, hərəkət etmək, səy göstərmək, yubanmamaq, cəld tərpən-

mək. *Bir əl-ayaq eləsək, işin canı alınar. – Bədəlovun taqımı doğrudan da elə əl-ayaq elədi ki, Mədədov onları görəndə təəccübdə qaldı.* Ə.Əbülhəsən; 2) tapmaq, əldə etmək. *Zəhmət çək, mənə bir paket əl-ayaq elə.* Mir Cəlal. **Əl-ayaq kəsilmək** – bax **əl-ayaq yığılmaq**. *Kənddə əl-ayaq kəsilmişdi.* Ə.Abasov. **Əl-ayaq qoymaq** – bax **əl qoymaq** 2-ci mənada ("**əl**"də). **Əl-ayaq oynatmaq** – 1) çapalamaq; 2) *məc.* hədələmək. **Əl-ayaq tərpətmək** – cəld işləmək, tələsmək, hərəkətə gəlmək, səy etmək. *Bir əl-ayaq tərpət görək.* – [Eyvaz kişi] *bir qədər əl-ayağını tərpədərək üzdüsə də, birdən suların arasında yox oldu.* Ə.Vəliyev. **Əl-ayaq vermək** – kömək etmək. *Qonaqlıqda əl-ayaq verən çox olduğundan hər iş qaydalı gedirdi.* **Əl-ayaq yetişməmək (çatmamaq)** – çox uzaqda olmaq, görüşmək mümkün olmamaq. *Cənnətin hurisi, ərzin mələki; Yetişməz, yüz qala, əl-ayaq sənə.* Q.Zakir. **Əl-ayaq yığılmaq (yığışmaq, yığışılmaq)** – gediş-gəliş, hərəkət kəsilmək, hamı evinə çəkilmək. *Axşamdan xeyli keçmişdi, kənddə əl-ayaq çoxdan yığılmışdı.* M.Hüseyn. **Əl-ayaqda qalmaq** – ortada qalmaq, başqalarının əvəzinə cavab verməli olmaq. *Qadın bağırırdı*: – *..Hərəniz özünüzü bir deşiyə soxun, əldə-oyaqda mən qalım!* Ə.Əbülhəsən. **Əl-ayaqda olmaq** – hazırlıq görmək, tədbir görmək, amadə olmaq, hazır olmaq. **Əl-ayaqdan düşmək** – əldən düşmək, bərk yorulmaq. *Mən səni izləməkdən düşmüşəm əl-ayaqdan.* S.Rüstəm. **Əldən-ayaqdan düşmək** – bax **əl-ayaqdan düşmək**. **Əldən-ayaqdan getmək** – bax **əldən getmək** 1-ci mənada ("**əl**"də). *Onun üçün nə əldən-ayaqdan gedirsən? – Kimisi əldən-ayaqdan gedir, kimisi sadəcə gülür, kimisi də haylı-küylü danışığı ilə özünü gözə verməyə cəhd edirdi.* S.Rəhimov. *Bəndalı ustasının xahişinə tez və dürüst əməl eləmək üçün əldən-ayaqdan gedir, kürə qabağında fır-fır fırlanırdı.* Mir Cəlal. **Əldən-ayaqdan olmaq** – çox gəzməkdən yorulmaq, əldən düşmək. **Əldən-ayaqdan salmaq** – 1) çox gəzmək, hər yerdə olmaq; 2) taqətdən salmaq, yormaq. [İkinci mühafiz:] *Tüksüz yapıncı* .. [Ələmdarı] *bu fırtınada lap əldən-ayaqdan salacaqdır.* S.Rəhimov. **Əlini-ayağını çəkmək** – bir yerə daha gedib-gəlməmək, əlaqəsini kəsmək.

**ƏLBAQİ** *sif.* [*ər.*] Artıq qalan, qalıq. *..Qalan əlbaqi paraların kimlərə paylandığı haqqında hesab verir.* M.S.Ordubadi. // *is.* Qalan pul, pulun verilməyib qalan hissəsi. *Pulun əlbaqisi kimdən çatacaq?*

**ƏLBƏƏL** *zərf* 1. Əldən-ələ, birindən-birisinə. *Kitab əlbəəl gəzdi. – Muradım, səninlə verəm əlbəəl; Bu gülşən içində gəzəm əlbəəl.* Aşıq Murad.

2. Cəld, tez, əlüstü, dərhal, o saat. *Xubların yaxşısı olmaz kəmməhəl; İşarə edən tək gələr əlbəəl.* Q.Zakir. [Rəhim xan:] *Sən gərək Tehrana səfər edib Mirzə Rzanın qızını əlbəəl şaha təqdim edəsən.* C.Cabbarlı.

**ƏLBƏSƏ** *is.* [*ər.* "əlbisə" – "libas" söz. cəmi] *köhn.* Libas, paltar. *Dərhal dimdik qalxdım. Əlbəsəmi geydim.* A.Şaiq. [Kor kişinin] .. *əlbəsəsinin tərzi, biçimi avamlığını .. andırırdı.* S.Hüseyn.

**ƏLBƏSƏLİ** *sif. köhn.* Əlbəsə geymiş, paltarlı, paltar geymiş. *Gözəl əlbəsəli adam. – Önündən qələbəliyi yarıb keçən arabaları, isti əlbəsəli, şən çöhrəli insanları .. süzdü.* A.Şaiq.

**ƏLBƏSƏLİK** *sif. köhn.* Əlbəsəyə yararlı, əlbəsə üçün olan; paltarlıq. *Əlbəsəlik parça. – Onun içinə oğlan evi bir əlbəsəlik ipək parça, iki imperial və bunun əmsalı bir şey qoyub qaytaracaqlar.* R.Əfəndiyev.

**ƏLBƏT** [*ər.*] 1. Bax **əlbəttə**. *Əlbət gələcəkdir. Dünyaya gələn əlbət gedər. – Demək olmaz dirilər tək yatıb, əlbət duracaq; Ölülər yatmağıdır, yox buna payan, ölüb... ə!* M.Ə.Sabir. □ **Əlbət ki** – təbii ki, şübhəsiz. *Əlbət ki, on il bundan qabaq belə proyekt mühüm idi.* Mir Cəlal.

2. *ara s.* Yəqin (ki), görünür (ki). *Əlbət, bunda bir sirr var. – Dərvişəm, kəşkülüm var; Hər güldən beş gülüm var; Gəlmişəm mən qapına; Əlbət, bir müşkülüm var.* (Bayatı). [Səlimə:] *Əlbət, odunu satılmır nədi, kəsdirib bazarı ac-susuz.* Ə.Haqverdiyev. *Sevgisiz, yoldaşsız bir gözəl kimi; Sükuta qərq olub yaşardın, əlbət.* M.Dilbazi.

**ƏLBƏTTƏ** 1. *zərf* Mütləq, hər halda. *Əlbəttə gəlməlidir. Getmək əlbəttə lazımdır. – Bir belə adamın içində yəqin; Əlbəttə, bədnəzər var, oynamasın.* Q.Zakir. [Müsyö Jordan:] *Əlbəttə sehrdir, mat qalmalı işdir, bir türfətüleyndə qəflətən Parij xarab olubdur.* M.F.Axundzadə.

2. *ara s.* Şübhəsiz, təbii ki. *O, əlbəttə, haqlıdır. – Ol qədər cövr etmə üşşaqə ki, səndən çəksin əl; Şah rəiyyətsiz ola, əlbəttə, şövkətdən düşər.* S.Ə.Şirvani. [Mazandaranski:] *Əlbəttə, mən heç özümü səndən əskik adam bilmirəm.* C.Cabbarlı.

**ƏLBƏYAXA** 1. *is.* Şiddətli dava, vuruşma; mübarizə. [Kərim] *bilirdi ki, əlbəyaxa vaxtı dəmadəm yaxınlaşır.* S.Rəhimov. *Mən bu qara xəyallarla əlbəyaxa ikən, birdən, deyəsən, gözümə bir işıltı dəydi, yox oldu, yenə göründü.* M.Rzaquluzadə. ☐ **Əlbəyaxa olmaq** – bərk vuruşmaq, çarpışmaq; mübarizə etmək. *Çar hökumətinin siyasəti çarın işğal orduları ilə bizi əlbəyaxa olmağa məcbur etdi.* M.S.Ordubadi. *Ər və arvad əlbəyaxa oldular.* C.Məmmədquluzadə. [Yusifin] *cəbhədə keçirdiyi günlər, ölümlə əlbəyaxa olub, ad-san qazandığı vaxtlar gözünün qabağına gəldi.* B.Bayramov.

2. *sif.* Şiddətli, amansız. *Əlbəyaxa çarpışma getdikcə şiddətlənirdi.* Ə.Əbülhəsən. ☐ **Əlbəyaxa vuruş(ma)** – silahsız halda və ya soyuq silahla aparılan döyüş. *Pilləkəndə əlbəyaxa vuruşma uzun çəkdi.* Mir Cəlal. *Mən səni düşünərək getdiyim zaman huşa; Bəlkə də sən girirsən əlbəyaxa vuruşa.* Ə.Cəmil. **Əlbəyaxa vuruşmaq** – bir-birindən yapışmaq, şiddətli vuruşmaq. *Araz onlarla əlbəyaxa vuruşaraq təslim olmurdu.* A.Şaiq. *Müşkünaz təkliklə əlbəyaxa vuruşur, bu təkliyi evdən qovub uzaqlaşdırmaq istəyirdi.* Ə.Vəliyev.

**ƏLBİR** 1. *zərf* Bir-birinə kömək edərək; bərabər, birgə, birləşərək. *Əlbir işləmək.* – [Altunbay:] *Elxan biləgənli, sən Solmazı sevir isən, özündə onu qoruyacaq bir cəsarət duyur isən, and iç, əlbir çalışaq.* C.Cabbarlı. [Nəbi:] *Düşünüb bayaqdan tökmüşəm tədbir; Gərək sinə gərək düşmənə əlbir!* S.Rüstəm. // Şərik, bir yerdə, birlikdə. *Bu işi onlar əlbir görmüşlər.* ☐ **Əlbir olmaq** – yoldaş olmaq, birgə hərəkət etmək, bir məqsəd üçün birləşmək. *Əlbir olub bir ayı bir şir ilə; Ovladılar dovşanı tədbir ilə.* A.Səhhət. [Nəbi:] *Əlbir olub od salmaq üçün düşmənlərin canına; Sinən üstdən yol ver, keçim qardaşımın yanına!* S.Rüstəm. *Bir hökmdar deyil, yığılıb hətta; Yüzü əlbir ola, gələ, verməərəm!* M.Rahim.

2. *sif.* Həmrəy, çox yaxın, birgə işləyən. *Əlbir yoldaşlar. Əlbir iş. – İndi, indisə sürət qatarında qızıl diplomla, əlbir və ürəkbir yoldaşlarımla evə dönürəm.* Mir Cəlal.

**ƏLBİR-DİLBİR** b a x **əlbir.** [Nəcmi:] *Bu vaxta kimi əlbir-dilbir, asayişlə yaşayan .. bu dinc camaatın arasına nə üçün iğtişaş düşsün?* Ə.Əbülhəsən. [Hacı:] *Buxaralı Buxaradan, Bağdaddan, Tehrandan – adını müsəlman qoyan gərək əlbir-dilbir səy eləsin.* Mir Cəlal. *Hər halda gümanım budur ki, əlbir-dilbir olsaq, Xanpəri xalanı düz yola gətirə biləcəyik.* Ə.Vəliyev.

**ƏLBOMBASI** *is.* Əl ilə tullanılıb atılan bomba. *Dəstə komandiri hər əsgərə 35 güllə və iki əlbombası payladı.* Mir Cəlal.

**ƏLBORCU** *is.* Tez ödənilmək şərti ilə verilən, ya alınan azacıq borc pul, yaxud başqa şey. *Əlborcu almaq. Mənə on manat əlborcu ver. – ..Yaşıdlarından və yaxın dostlarından biri, bu gün ondan əlborcu qazıma borusu istəməyə gələndə Qüdrətdən bunun da səbəbini soruşdu.* M.Hüseyn. [Surxay:] *..Sən öləsən, Hüseyn, bu gün evimizdə çörək olmayıb, gəlmişəm, səndən bir az əlborcu pul alam.* S.Rəhman.

**ƏLCƏ** *sif.* Kiçik, azacıq, bir tikə, əl qədər. *Əlcə çörək. Əlcə ət. – Anası bir əlcə əppəyə dönüb yoxa çıxıbdır.* S.Rəhimov. *Mövqeyə gələn kimi Abbas karandaşla bir əlcə kağıza ərizəsini yazdı, üç nəfərdən zəmanət aldı.* Ə.Əbülhəsən. [Gülzar:] [Ağalarov] *dişini bizim o bir əlcə torpağa qıcadıb.* Ə.Məmmədxanlı.

**ƏLCƏCİK** *sif.* Lap balaca, balaca əl boyda (adətən “bir” sözü ilə). *Yun şalına bürünmüş bir əlcəcik çöhrəsində Ağcanın gözləri parlayıb yanırdı.* Ə.Əbülhəsən.

**ƏLCƏK** *is.* Əli soyuqdan və s.-dən qorumaq üçün barmaqlı, ya barmaqsız əl geyimi. *Uzun əlcək. Əlcək toxumaq. Meşin əlcək.*

*Qadın əlcəkləri. Beşbarmaq əlcək. Təkbarmaq əlcək. Bir corab, bir əlcək, bir isti köynək; Bir də ki yun başlıq göndərirəm, al!* S.Vurğun.

**ƏLCƏKTİKƏN, ƏLCƏKTOXUYAN** *is.* Parçadan əlcək tikən, yaxud yundan, iplikdən əlcək toxuyan usta.

**ƏLÇATAN** *sif.* 1. Hündür olmayan, əl çata bilən, alçaq. *Əlçatan divar. Əlçatan rəf.*

2. Uzaq olmayan, yaxın. *Əlçatan yer.*

3. Əldə edilə bilən, ələ düşə bilən, münasib.

**ƏLÇATMAZ** *sif.* 1. Hündür, uca, yüksək. *Əlçatmaz minarə. Əlçatmaz hasar.* // *məc.* Yetişmək, nail olmaq, əldə etmək mümkün olmayan. [Adilə:] *Mən yaxında, əlim altında olan səadətə qovuşmaq istəyirəm, uzaqlara, əlçatmaz səadətlərə doğru qaçmaq istəmirəm.* Ə.Məmmədxanlı.

2. Uzaq, gedib-gəlmək çətin olan. *Əlçatmaz yer. – Cüməyəm, müşküldü aşıqla hallar; Neyləyim, əlçatmaz, uzaqdır yollar.* Aşıq Cümə. *Onları apardılar özlərilə dağlara; Kəndlərə, şəhərlərə, əlçatmaz uzaqlara.* S.Rüstəm.

3. Möhkəm, alınması, tutulması, girilməsi mümkün olmayan, ya çətin olan. [Məhərrəm:] *Rüstəm bəy evini eyləyib bir əlçatmaz qala.* N.Vəzirov.

**ƏLÇATMAZLIQ** *is.* Əlçatmaz şeyin halı, vəziyyəti; uzaqlıq, yaxud yüksəklik, hündürlük.

**ƏLÇİM, ƏLÇİN** *is.* Bir dəfədə əldə tutulub cəhrədə ip halına gətirilə bilən qədər (yun). *O arvad gündə yüz əlçim yun əyirir.* – [Tapdıq] *..gah yun darağının qoynuna yığılmış əlçimlərə, hərdənbir də cəhrənin tağalağına çox diqqətlə baxırdı.* Ə.Vəliyev. *İndi cəhrə uğuldayır, uğuldadıqca yun əlçimi eşilib sapa dönərək iyə toplanırdı.* Ə.Əbülhəsən. □ **Bir əlçim** – bir əldə tutulacaq qədər. *Göy açıq; Nə bir əlçim bulud; Nə bir qucaq duman.* R.Rza.

**ƏLDARAĞI** *is.* Yun daramaq üçün taxta altlığa bənd edilmiş, ucu şiş məftillərdən ibarət alət; daraq.

**ƏLDƏBİR** *sif. məh.* Birinci növbədə nəzərə alınmalı olan; vacib, lazım.

**ƏLDƏKİ** *sif.* Əldə olan, ortada olan, mövcud olan, nağd. *Əldəki vəsaitdən lazımınca istifadə etməli.*

**ƏLDƏQAYIRMA, ƏLDƏQAYRILMA** *sif.* 1. Fabrik, ya zavodda deyil, əl ilə qayrılmış, düzəldilmiş, istehsal edilmiş. *Əldəqayrılma şey. – Bəzi mağaza müdirləri .. əldəqayırma çəkmələri fabrik məhsulu adı ilə camaata satırlar.* "Kirpi".

2. *məc.* Biliyi, hazırlığı, bacarığı olmayan, öz sənətini, işini pis bilən; ləyaqətsiz. *Bu əsərindən də görünür ki, bəzi əldəqayrılma alimlər kimi, ordan-burdan çırpışdırmır.* M.Hüseyn. // Qeyri-həqiqi, yalançı. [Qənbərqulu:] *Heç tikə də yaraşmır, çünki sən əldəqayırma bəysən. Bəyin gərək dədəsi də bəy ola.* B.Talıblı.

**ƏLDƏN** *zərf* 1. *dan.* Tez, arada, cəld. *Əldən get, bazardan qənd al, gəl.*

2. Mağazadan yox, xüsusi şəxsdən, alverçidən. *Əldən almaq.*

**ƏLDƏYİRMANI** *is.* Un üyütmək, yarma çəkmək üçün əl ilə işlədilən kiçik dəyirman. *Axşam lampa işığında Telli əldəyirmanı ilə yarma çəkirdi.* S.Hüseyn. // İstiot, qəhvə, duz və s. kimi şeyləri üyütmək üçün əl ilə işlədilən kiçik maşın; kirkirə.

**ƏLDƏYMƏMİŞ** *f.sif.* Toxunulmamış. [Qərib:] *Üç gözəlin biri bizə qohumdur; O birisi əldəyməmiş qovundur.* "Aşıq Qərib". *Bizə bu dağ, bu dərə; Təslim olsun bir kərə! Əldəyməmiş yerlərə; İşləsin qüvvətimiz..* S.Vurğun.

**ƏLDƏYMƏZ** bax **əlçatmaz**.

**ƏLEYH** [*ər.*] Adətən "əleyhinə" şəklində adlıq və yiyəlik hallardan sonra işlənir: ...ziddinə, ...qarşı. *Əleyhinə səs vermək. Əleyhinə getmək. Təklifin əleyhinə çıxmaq. Düşmən əleyhinə.* – [Nəsir] *də məlum fikirlər üzərində ləhinə və əleyhinə olmaq üzrə söz söyləyirdi.* S.Hüseyn. *Bəzi kəndlilərə də kimin lehinə, kimin əleyhinə, nəyə qarşı əl qaldırmağı başa salmaq çətin idi.* Mir Cəlal. *Əziz təklifin əleyhinə səs verdi.* Ə.Əbülhəsən.

**ƏLEYHDAR** *sif.* [*ər.* əleyh və *fars.* ...dar] Əleyhinə, ziddinə, əksinə olan; düşmən. *O sizə əleyhdar adam deyil. Onda mən əleyhdar bir hərəkət görmədim.* // İs. mənasında. *..Əleyhdarlar böyük ədibin kəlamına təslim olmuşdular.* Mir Cəlal.

**ƏLEYHDARLIQ** *is.* Əleyhinə, ziddinə olma; düşmənçilik. *..Vəliəhdin* [yerinə] *rus əleyhdarlığı ilə məşhur olan Nizamülmülkü təyin etdilər.* M.S.Ordubadi.

**ƏLEYKƏSSALAM, ƏLEYKÜMƏSSALAM** *nida* [*ər.*] Sizə (sənə) də salam olsun! "Salaməleyküm"ə (salama) cavab ifadəsi. [Yusif:] *Ay əleyküməssalam, qardaşlar, əyləşiniz.* N.Nərimanov. *Əleykəssalam, keyfin yaxşı olsun.* H.Nəzərli.

**ƏLEYHQAZ** *is.* [*ər.* əleyh və *fr.* qaz] Zəhərləyici maddələrdən, qazlardan, tüstüdən və s.-dən qorunmaq üçün filtrli maska. *Bölük bir darvazanın tuşunda azacıq ləngidiyi vaxt, çiynində əleyhqaz darvazada dayanan arvad gülə-gülə Mahmuda dedi..* Ə.Əbülhəsən.

**ƏLƏF** *is.* [*ər.*] b a x **alaf.** *Biri gedib ələf tökür kəllərə; Biri baxır xırmandakı vəllərə.* A.Səhhət. *Xanqulu mərəkdən ələf gətirib atın qabağına qoydu.* S.Rəhimov.

**ƏLƏFİYYAT** *is.* [*ər.* "ələf" söz. cəmi] Cürbəcür otlar. *O deyirdi ki, Avropa həkimləri ələfiyyatdan bixəbərdirlər.* Qantəmir. *Ha zamandansa Məsmə eşitmişdi ki, dərmanların yaxşısı ələfiyyatdır.* Mir Cəlal.

**ƏLƏFİYYATÇI** *is. köhn.* Keçmişdə nəbatatçıya verilən ad *..Bitki sistematikası öz başlanğıcını XVI əsrdən götürmüşdür. Bu əsrdə "ələfiyyatçılar" adlanan alimlər meydana çıxmışdı.* M.Qasımov.

**ƏLƏGƏLƏN** *sif.* Əldə edilə bilən, əldə edilmiş. *Ələgələn şey.*

**ƏLƏK** *is.* Unun kəpək və qeyri zibillərini təmizləmək üçün sağanağa keçirilmiş sıx tordan ibarət alət. *Ələk dairəvi qutu şəklində olur. – Dağılıb çöllərə açdı hərə bir növ kələk; Sac Lahıcdan qurtarıb, qalmadı Salyanda ələk.* S.Ə.Şirvani. *Nəhəng ələkdən un ələnən sayağı qar ələnir, dəqiqələr keçdikcə yer təknəsi daha çox dolur, daha çox ağarırdı.* Ə.Əbülhəsən.

◊ **Ələyi ələnib, xəlbiri sulanıb** – işi bitib.

**ƏLƏKÇİ** *sif.* Ələk qayıran və satan adam.

◊ **Ələkçinin qıl verəni** *isteh.* – əslində heç bir ciddi işlə məşğul olmayıb, özünü iştirakçı, köməkçi kimi göstərməyə çalışan, yaxud ara qızışdıran adam haqqında.

**ƏLƏKÇİLİK** *is.* Ələkçinin işi, peşəsi, sənəti.

**ƏLƏKEÇMƏZ** *sif.* Əldə edilə bilməyən, ələ keçirmək mümkün olmayan, tapılması çox çətin olan. *Ələkeçməz şey. Ələkeçməz fürsət.*

**ƏLƏKEÇMƏZLİK** *is.* Ələ keçməsi, əldə edilməsi, tapılması mümkün olmama, yaxud çətin olma.

**ƏLƏKLƏMƏ** "Ələkləmək"dən *f.is.*

**ƏLƏKLƏMƏK** b a x **ələmək**.

**ƏLƏKLƏNMƏ** "Ələklənmək"dən *f.is.*

**ƏLƏKLƏNMƏK** b a x **ələnmək**.

**ƏLƏKLİ** *sif. xüs.* Ələyi olan. *Ələkli konveyer.*

**ƏLƏK-VƏLƏK** *is.* Qarışıqlıq, alt-üst. *Bu yerdə yer tapılmaz artıq qüssəyə, dərdə; O yerdəsə ürəklər dərddən ələk-vələkdir.* S.Rüstəm. ☐ **Ələk-vələk eləmək (etmək)** – alt-üst etmək, dağıtmaq. *Otaqları bir-birinə vurdular. Güman gələn yerləri ələk-vələk elədilər.* Mir Cəlal.

**ƏL-ƏLBƏT** *zərf dan.* Mütləq, lap yəqin, hər necə olur olsun, hər halda. *Əl-əlbət gəlin.*

**ƏL-ƏLƏ** *zərf* 1. Bir-birinin əlindən tutaraq. *Əl-ələ oynadılar. Əl-ələ yerimək.*

2. Birgə, bir yerdə, həmrəycəsinə, dostcasına. *Əl-ələ işləmək. Əl-ələ çalışmaq.*

◊ **Əl-ələ, baş-başa** – haqq-hesabı qurtarma, alış-verişi və ya hər hansı bir işdən, oyundan və s.-dən həm ziyansız, həm də qazancsız çıxma. [Məşədi Möhsün:] *Deməli, bir kasa da qaymaq gəlsə, əl-ələ, baş-başa çıxırıq.* Mir Cəlal. **Əl-ələ vermək** – bir-birinə kömək etmək, köməkləşmək, birlikdə çalışmaq. *Əl-ələ verib işləmək. – Qız xoşbəxt, oğlan xoşbəxt – ikisi də əl-ələ verib şad və xürrəm .. ömür sürürdülər.* Çəmənzəminli. [Sara:] *Sən ac, mən də ac, gedək, bir guşeyi-xəlvətdə əl-ələ verib işləyək, yaşayaq.* C.Cabbarlı. *Həmin gecə Əkbərlə Ayaz əl-ələ verib şəhərdən qaçdı.* Mir Cəlal. **Əl-ələ tutmaq** – b a x **əl-ələ vermək.**

**ƏLƏLXÜSUS** *zərf* [*ər.*] Xüsusilə, xüsusən. [Cahan:] *Xalan sənə qurban, evlənmək su içmək kimi asan şeydir, onda nə çətinlik var ki? Əlalxüsus sənin kimi cavana.* Ü.Hacıbəyov. *Əlalxüsus yazıq Nurəddinin günü qara olmuşdu.* S.S.Axundov. [Axund:] *Bu nikah kəsməkdən və ya kəsdirməkdən zorba savab yoxdur, əlalxüsus siğə ola.* C.Cabbarlı.

**ƏLƏM**[1] *is.* [*ər.*] Dərd, qəm, kədər, qüssə. *Ələm, məşəqqət adamı tez qocaldır. – Canə yetdim aləmi-hicran ilə, ey zalim! Rəhm qıl, canım üçün var isə bir dərmanın.* Füzuli. *Cəm olsa yanımda tamam sənəmlər; Dağılmaz könlümdən fikrü ələmlər.* M.P.Vaqif. *Qəhrəmanın gözləri yaşarmışdı, səsində dərin bir ələm və təəssüf duyulurdu.* H.Nəzərli.

**ƏLƏM**[2] *is.* [*ər.*] Bayraq (adətən dini ayinlərdə işlədilən bayraq).

**ƏLƏMAN** b a x **əlaman**. *Haçanacan aman çəkim bu zalım hicran əlindən; Bu ev yıxan ələmdarın aman, ələman əlindən.* Aşıq Xəlfə.

**ƏLƏMDAR** *sif.* [*ər.* ələm və *fars.* ...dar] *köhn.* Bayraqtutan, bayraqçı, bayraqdar.

**ƏLƏMDARLIQ** *is. köhn.* Bayraqdarlıq.

**ƏLƏMƏ** "Ələmək"dən *f.is.*

**ƏLƏMƏK** *f.* 1. Ələkdən keçirmək. *..Qurban oturdu otağın bir küncündə və başladı gəci ələməyə.* C.Məmmədquluzadə.

2. *məc.* Səpmək, səpələmək, tökmək. *Yağış ələyir. – Günəş şəhərə od ələdiyi halda səkilər tez-tələsik yeriyən adamlarla dolu idi.* M.Hüseyn. *Bütün günü hər tərəfə od ələyən günəş təzəcə batmışdı.* M.İbrahimov.

**ƏLƏMLİ** *sif.* Qəmli, kədərli, qüssəli.

**ƏLƏMLİLİK** *is.* Ələmli (qəmli, kədərli, qüssəli) adamın halı; qəmlilik, kədərlilik, qüssəlilik.

**ƏLƏMNAK** [*ər.* ələm və *fars.* ...nak] b a x **ələmli**.

**ƏLƏNGƏ** *is.* Quru sümük. *At-inəyin, kəlin bəhsi düşəndə; Çoxu bir ələngə leşdən danışır.* "Məsum".

**ƏLƏNMƏ** "Ələnmək"dən *f.is.*

**ƏLƏNMƏK** *məch.* 1. Ələkdən keçirilmək. *Un ələnmişdir.*

2. *məc.* Çoxlu miqdarda tökülmək. *Bir qədər sonra toz çoxaldı, sanki havadan un ələnirdi.* Mir Cəlal.

**ƏLƏŞƏN-GÜLƏŞƏN** *is. dan.* Mənasız, boş şey. *Ələşən-güləşən sözlər danışır. – Nə bilim, ələşən-güləşən şeylər görmüşəm.* S.Rəhimov.

**ƏLƏTDİRİLMƏ** "Ələtdirilmək"dən *f.is.*

**ƏLƏTDİRİLMƏK** *məch.* Ələkdən keçirdilmək.

**ƏLƏTDİRMƏ** "Ələtdirmək"dən *f.is.*

**ƏLƏTDİRMƏK** b a x **ələtmək**. *Unu ələtdirmək.*

**ƏLƏTMƏ** "Ələtmək"dən *f.is.*

**ƏLƏTMƏK** *icb.* Ələmə işi gördürmək, ələkdən keçirtdirmək. *Un ələtmək. Bənna fəhləyə qum ələtdi.*

**ƏLFƏCİN** *is.* Kitabın səhifələri arasına nişan üçün qoyulan lentşəkilli kağız parçası. *Kitabın ortasında qəzet kağızından qayrılmış əlfəcin vardı.* M.Hüseyn. ☐ **Əlfəcin qoymaq** *zar.* – qurtarmaq, tamamlamaq, kəsmək, ara vermək. [Veys:] *Bülənd, heç olmasa burda əlfəcin qoyasan. Bəs olmadımı?* Ə.Əbülhəsən.

**ƏLHAL** *zərf* [*ər.*] *klas.* İndi, bu halda, bu anda. *Düşdün niyə bəs bu hala əlhal? Bilməm nə səbəbdən olmusan lal?* M.Ə.Sabir. *Millət deyə ağlar, bir mərsiyəxandır; Anlar hələ sonra, əlhal cavandır.* Ə.Nəzmi.

**ƏLHAN** *is.* [*ər.* "ləhn" söz. cəmi] *klas.* Gözəl səslər, gözəl nəğmələr, təranə. *Quşların əlhanı, ey dil, bəs müəssərdir bu fəsl.* Əmani. *Bağda açdı üzündən o güli-tazə niqab; Çaşdırıb bülbül özün, eylədi əlhanı qələt.* S.Ə.Şirvani. *Bülbüllərin əlhanı, çiçəklərdəki əlvan; Olmaz şu mənim çındıracaq könlümə əlan; Bir mənbəi-ilham.* H.Cavad.

**ƏLHASİL** *is.* [*ər.*] *köhn.* Sözün gödəyi, sözün qısası, xülasə, bir sözlə, nəhayət. *Əlhasil, gəlib şəhərə çatdıq. – Bil ki, məqsudə olarsan vasil; Yerdə, gögdə, nə isə, əlhasil.* A.Səhhət.

**ƏLHAVASI** *zərf dan.* Heç şey görmədən, əl duyğusu vasitəsilə. *Əlhavası yerimək. – Nişançılar isə qaranlıqda əlhavası silahlarını, xüsusən çaxmaqlarını təmizləyir*(*dilər*). Ə.Əbülhəsən.

**ƏLHAY** *is.* Hay-küy, təlaş, əl-ayağa düşmə. *Şəbistan əlhayla* (z.) *içəriyə girdi.* S.Rəhimov. ☐ **Əlhaya düşmək** – əl-ayağa düşmək, təlaşa düşmək, ora-bura qaçışmaq. *Ancaq kim nə təhər əlhaya düşsə də, el-oba sevinir, Qaçaq Nəbinin şəninə məclislər qurulur.* S.Rəhimov. *Qadir .. Həmzənin əlhaya düşdüyünü, qəsəbəyə necə qaçdığını xəyalına gətirib öz-özünə acı-acı düşünürdü.* Ə.Əbülhəsən.

**ƏLHƏD: əlhəd daşı** – qəbirdə ölünün başı söykəndiyi daş. *Qəbrimi özgə qazıb; Əlhədim dar düşübdü.* (Ağı).

◊ **Başı əlhəd daşına dəymək** – bərkdən-boşdan çıxaraq, bir şeyin aqibətini təcrübədə görərək ayılmaq, özünə gəlmək. *Əmirxanın başı dəydi əlhəd daşına; O ayıldı məclislərin gec yuxusundan.* S.Vurğun. *Başı əlhəd daşına dəyəndən bəri, yəqin ki, səhvlərini anlayıb.* Ə.Vəliyev.

**ƏLHƏQ** *ara s.* [*ər.*] *köhn.* Həqiqətən, doğrusu, doğrudan da. *Əlhəq, münəccimbaşı dəxi, görünür ki, çox əlhəq imiş.* M.F.Axundzadə. *Kuyinda görmək əğyari; Əlhəq, mənə cəfadır bu.* Q.Zakir. *Əlhəq, əlhəq, gözəl binasən!* M.Ə.Sabir.

**ƏLHƏMDÜLLAH** *is.* [*ər.*] *din.* Allaha şükür olsun, şükür Allaha. [Məşədi İbad:] *Qoca odur ki, dişləri olmaya, gözü görməyə, qulaqları eşitməyə, özü də yerindən tərpənə bilməyə; mən ki, əlhəmdüllah, quş kimiyəm.* Ü.Hacıbəyov. *İskəndər əmi payını yeyib qurtarandan sonra, "əlhəmdüllah" deyib dodaqlarını sildi.* M.Hüseyn.

**ƏLHƏZƏR** *nida.* 1. Qaç! qorx! uzaq ol! üzünü görmə! *İkiüzlü adamlardan əlhəzər! – Arvad üzlü kişidən, kişi üzlü arvaddan əlhəzər.* (Ata. sözü). *Əlhəzər, yay qaşın şux peykanından; Vurar, yıxar, ötmək olmaz yanından.* Q.Zakir. □ **Əlhəzər etmək** – uzaq olmağa çalışmaq. *Əlhəzər et, bir yeni şeytandı bu!* M.Ə.Sabir.

2. Rədd olsun, uzaq olsun. *Əlhəzər, haraya istəyir, qoy getsin.*

**ƏLİAÇIQ** *sif.* Ürəkdən başqalarına pul, mal və s. ilə kömək edən; səxavətli, comərd. *Əliaçıq adamın ürəyi də açıq olar.* (Məsəl). *Bir qədər gənclərlə oynadıqdan sonra əliaçıq tamaşaçılar* [Altıaylığa] *üçlük, beşlik, onluq əskinas* (*kağız pul*) *bağışlardılar.* H.Sarabski. [Dilənçilər] *tanıdıqları ərbablardan kiminin xəsis və kiminin əliaçıq olduğunu yaxşı bilirdilər..* Ə.Sadıq.

**ƏLİAÇIQLIQ** *is.* Əliaçıq adamın hal və sifəti; səxavətlilik, comərdlik, səxavət. *Əliaçıqlıq yaxşı sifətdir. – Nəbinin igidliyi, əliaçıqlığı dillərdə dastan olur.* "Qaçaq Nəbi".

**ƏLİAĞIR** *sif.* 1. Qüvvətli, güclü, zorlu. *Əliağır adam.*

2. *məc.* Bir işə uğursuzluq gətirən (*əliyüngül* ziddi). *Əliağır adam.*

**ƏLİAĞIRLIQ** "Əliağır"dan *mücər.*

**ƏLİALLAHI** *is.* Müsəlman təriqətlərindən birinin adı və bu təriqətə mənsub adam.

**ƏLİALLAHILIQ** *is.* Əliallahı təriqəti (b a x **əliallahı**).

**ƏLİAŞAĞI** *sif.* Yoxsullaşmış, maddi cəhətdən çətinlik çəkən. *Əliaşağı* (z.) *olmaq.*

**ƏLİAŞAĞILIQ** *is.* Əli aşağı düşmüş adamın hal və keyfiyyəti; yoxsulluq.

**ƏLİBAĞLI** *sif.* 1. Əlləri bağlanmış halda olan. *Əlibağlı dustaq.*

2. *məc.* Hər cür hərəkət və təşəbbüs imkanından məhrum. *Əlibağlı* (z.) *olmaq.*

**ƏLİBOŞ** 1. *sif.* Yoxsul, heç bir şeyi olmayan; fəqir. *Əliboş adam.* // Əlində heç bir şey olmayan, heç bir şeysiz. *Əliboş Cəmil indi xəstə nənəsinin yanına hansı üzlə dönəcək, ona necə cavab verəcəkdi?* S.Rəhimov.

2. *zərf* Əlində heç bir şey olmadan, özü ilə heç bir şey götürmədən. *Əliboş evə gedə bilmərəm. Xəstənin yanına əliboş getmək yaxşı deyil. – Allahverdi Nəbinin yanına əliboş getmir.* "Qaçaq Nəbi". *Züleyxanın əliboş olduğunu görcək anası anladı ki, qonşularda da yeməli bir şey tapılmamışdır.* T.Ş.Simurq. // *məc.* b a x **əliyalın**. *Canavarlara qarşı əliboş çıxmaq.* // Heç bir ov ələ keçirmədən. *Ovdan əliboş qayıtmaq.*

3. *zərf* İşsiz, bikar. *Əliboş qalmaq.* □ **Əliboş gəzmək** – boş-boş gəzmək, avara-avara gəzmək; veyillənmək.

**ƏLİBOŞLUQ** *is.* 1. Yoxsulluq, fəqirlik, heç bir şeyi olmama.

2. İşsizlik, bekarlıq. // Veyillik, avaralıq.

**ƏLİDOLU** *zərf* 1. Əlləri bollu şeylə dolu halda. *Əlidolu evə gəldi. – Lakin mən onun evinə əliboş gəlib əlidolu gedən, əlidolu gəlib əliboş gedən adamların kim olduqları ilə əsla maraqlanmıram.* S.Rüstəm.

2. *məc.* Müvəffəqiyyətlə, varlanmış halda. *Gedin, gedin, uğurunuz xeyir olsun, əlidolu qayıdasınız!* M.F.Axundzadə.

**ƏLİƏYRİ** *sif.* Düz olmayan, təmiz olmayan, fürsət düşəndə oğurluq edən; oğru. *Əliəyri adam.* // İs. mənasında. *Ticarət sisteminin əliəyrilərdən təmizlənməsi. –* [Salman] *əliəyrilərə hiss etdirirdi ki, bax, nə yuvanın quşu olduğunu bilirəm ha, yavaş ye.* M.İbrahimov.

**ƏLİƏYRİLİK** *is.* Təmiz, düzgün olmayan adamın hal və keyfiyyəti; oğurluq, oğurluğa meyil. *Sambalovun özünü əliəyrilik üstə işdən çıxartdılar.* S.Rəhman.

**ƏLİF**[1] *is* [*ər.* əsli *qəd. yəh.*] 1. Ərəb əlifbasının ا şəklində yazılan birinci hərfinin adı. *Əlifi dirək sayır, cimi çəngəl.* (Məsəl). *Bilmək nə gərək kim, bu əlifdir, bu da beydir? Həvvəz, sora hütti, bu nə heydir, o nə heydir?* M.Ə.Sabir. *Mirzə Həsən*: *– Necə ki Avropa, habelə Asiya millətlərinin hürufatının əvvəlincisi "a" sövtünün əlamətidir ki, biz ona "əlif" deyirik.* C.Məmmədquluzadə.

2. *məc.* Düz, şax, şaquli mənasında. *Həsrətindən əlif qəddim büküldü; Cismim bəndi yerbəyerdən söküldü.* M.V.Vidadi. ☐ **Əlif qəddi dal (yay, nun) olmaq, əlif qəddi dala (yaya, nuna) dönmək** *klas.* – beli bükülmək. *Hicran gecələri qayğu çəkməkdən; Əlif qəddim əyri yaya dönübdü.* "Qurbani". *Həsrətindən əlif qəddi dal olub; Mat qalıbdır, şirin dili lal olub.* M.P.Vaqif. **Əlifdən başlamaq** – lap əvvəldən, lap başdan başlamaq.

**ƏLİF**[2] [*yun.*] Yağlı boya hazırlamaq üçün bişmiş kətan, ya çətənə yağı, yaxud süni surətdə hazırlanmış yağ. *Əlif yağı. – Əlif yağları tünd və açıq rəngli, şəffaf olur.* "Əmtəəşünaslıq".

**ƏLİFBA** *is.* [*ər.*] 1. Bir dildə işlənən və müəyyən qaydada sıralanan hərflərin məcmusu. *Azərbaycan əlifbası. Ərəb əlifbası. Latın əlifbası. – Biz buna təəccüb etmirik ki, Hüseynzadə cənabları əlifbamızın bilmərrə dəyişilməsinə fitva vermir.* C.Məmmədquluzadə. *Köhnə ərəb əlifbasının çətinliyi geniş xalq kütləsinin savadlanmasına imkan vermirdi.* S.S.Axundov. ☐ **Əlifba sırası** – əlifbada olan hərflərin müəyyən sistem üzrə düzülüş sırası.

2. Əlifbanı öyrədən kitab. *Əlifba kitabı.*

3. *məc.* Ən bəsit, ən sadə, hamıya məlum olan şey. *Bu, cəbrin əlifbasıdır.*

◊ **Morze əlifbası** – teleqrafda işlənən şərti işarələr sistemi. **Not əlifbası** – musiqi notlarında işlənən işarələr sistemi.

**ƏLİFBEY** b a x **əlifba**. *Əlifbey də bilmir* (heç savadı yoxdur). *– Hər əlibey oxuyan gər ola peyğəmbəri-həqq; Mən də peyğəmbərəm, amma kim edir küfranı.* S.Ə.Şirvani. [Həmzə:] *Xeyr a!.. Yenə* [axund] *başladı əlifbeydən..* C.Cabbarlı. *On yaşında ikən o da həmin zavodda işləməyə başlamış və orada da qoca fəhlələrdən əlifbeyi öyrənmişdi.* M.İbrahimov.

**ƏLİF-ƏLBƏT(TƏ)** *zərf dan. köhn.* Mütləq, yəqin, şübhəsiz. *Bəs nə səbəbə bu iş, əlbəttə, əlif-əlbəttə gərək sənin, mənim və şahidlərimin arasında qala, vəssalam!* C.Məmmədquluzadə. *Əlbəttə, əlif-əlbəttə əl əli yuyar, əl də üzü.* S.Rəhimov.

**ƏLİGƏTİRƏN** *sif.* Qumar və s. oyunlarda daim bəxti gətirən, həmişə udan.

**ƏLİGÖDƏK** *sif. dan.* Əlinə pul keçməyən; yoxsul, fəqir.

**ƏLİİSTİ** *sif.* Mahir atıcı, atıcılıqda cəld olan. *Əliisti adamın əlindən ov qurtara bilməz.*

**ƏLİİTİ** *sif.* Əldən çapıq; zirək, cəld. *Əliiti adam. – Bu iki işin ikisində də Leylək əliiti idi.* S.Rəhimov.

**ƏLİK** *is. zool.* Vəhşi keçi; keyik. *Davanın şiddətli vaxtında dağın döşündə bir sürü əlik göründü.* "Qaçaq Nəbi". *Görürsənmi bu guruldayan dağları, indi orada əliklər hürküşür, dəstələnib dağları aşır, qalın meşələrə girirlər.* S.Rəhimov. *Əlik qayadan atılıb düzənlikdə ox kimi süzür.* M.İbrahimov.

**ƏLİKASAD** *is. dan.* Yoxsul, pulsuz.

**ƏLİKASADLIQ** *is. dan.* Yoxsulluq, pulsuzluq.

**ƏLİQABARLI** 1. *sif.* Cismani əməklə, xüsusilə əl əməyi ilə məşğul olan. *Əliqabarlı fəhlə.*

2. *is. məc.* Zəhmətkeş, əməkçi.

**ƏLİQAMÇILI** *sif.* 1. Əlində qamçı olan, əlində qamçı tutmuş. *Əliqamçılı süvari. Əliqamçılı polislər.*

2. *məc.* Zalım, qəddar, zülmkar mənasında.

**ƏLİQANDALLI** *sif.* Əllərinə qandal vurulmuş. // Dustaq, əsir.

**ƏLİQANLI** *sif.* və *is.* Cinayətkar, qatil, cani. *Əliqanlı cinayətkarlar öz cəzalarına çatacaqlar.* – [Sultan] *əliqanlı, .. bizim yoldaşlardan .. az-az həlak eləməmişdir.* S.Rəhimov. *Bürüyür ölkəni fəlakət seli; Bunun səbəbkarı əliqanlıdır.* M.Rahim.

**ƏLİL** *is.* və *sif.* Xəstəlik və ya qocalıq nəticəsində əmək qabiliyyətini itirmiş; şikəst. *Əlillər cəmiyyəti. Əlillər evi. Müharibə əlilləri. – Görürsüz ki, qocalmışam, əliləm; İndi, camaat əhli, sizə dəxiləm.* A.Səhhət. [Pəri xanım:] *Bir atam var əlil. Kimə dərdimi söyləyim?* Ə.Haqverdiyev. *Pirlər, ocaqlarda Münəvvər xanımın adı gələndə dilənçilər, əlillər qapıya hücum çəkərdilər.* Mir Cəlal.

**ƏLİLLİK** *is.* Əlil adamın hal və vəziyyəti. *Təqaüdün miqdarı əlillik dərəcəsinə görə təyin edilir.*

**ƏLİMYANDI** *zərf dan.* 1. Çox tələsik, tez, qaçaraq. *Bilmirəm keçən vaxt yaşılbaş sona niyə belə əlimyandı ilə axtarılırmış.* Ə.Haqverdiyev.

2. Darda, çıxılmaz vəziyyətdə. *Biz mal-qara üçün bol yem ehtiyatı toplanılmasını təmin edəcək, heyvandarlarımızı qışın sərt günlərində əlimyandıda qoymayacağıq.* (Qəzetlərdən).

**ƏLİRİŞMƏZ** b a x **əlyetməz**. *Şu uzaqlarda parlayan yıldız; Əlirişməz ümidlər kimidir.* M.Hadi.

**ƏLİUŞAQLI** *sif.* Körpə uşağı olan. *Əliuşaqlı qadın.*

**ƏLİUZUN** *sif. dan.* 1. Başqasının malına xəyanət edən, əl uzadan, onu mənimsəməyə, əlinə keçirməyə təşəbbüs edən, çalışan; oğurluğa meyli olan. *Əliuzun adam.*

2. Vurub-çatan, başqasını incidən.

3. Ümumi süfrədə çox yeməklə, hər qaba əl uzatmaqla nəzakətsizlik göstərən adam haqqında.

**ƏLİUZUNLUQ** *is.* Əliuzun adamın işi, hərəkəti; oğurluğa meyil. ☐ **Əliuzunluq etmək** – başqasının əmlakına, malına əl uzatmaq, onu mənimsəməyə, ələ keçirməyə, götürməyə təşəbbüs etmək, çalışmaq.

**ƏLİYALIN** *zərf* Əlində heç bir silah olmadığı halda, silahsız-yaraqsız.

**ƏLİYUXA** *sif. dan.* Mayası, pulu az olan; kasıb. *Əliyuxa adamdır.*

**ƏLİYÜNGÜL** *sif.* İştirakı ilə müvəffəqiyyət, uğur gətirən (*əliağır* ziddi). *Əliyüngül adam.*

**ƏLİYÜNGÜLLÜK** "Əliyüngül"dən *mücər.*

**ƏLKİMYA** *is.* [*ər.*] Orta əsrlərdə: guya iksir qatmaqla sadə metalları qiymətli metallara çevirmək mümkün olduğunu iddia edən, elmi kimyadan əvvəlki mistik elm.

**ƏLKİMYAÇI** *is.* Qədimdə: əlkimya ilə məşğul olan adam.

**ƏLQABI** *is. dan.* Aftafa. ☐ **Əlqabına çıxmaq** – təbii ehtiyac üçün çıxmaq.

**ƏLQƏRƏZ** *ara s.* [*ər.*] Xülasə, sözün qısası, müxtəsər, bir sözlə. *Əlqərəz, keçəl ilanı genə yeşiyə qoydu.* (Nağıl). *Bu qayğısız yaşamağı, əlqərəz; Bir şeylə etmək olarmı əvəz?* A.Səhhət. [Soltan bəy:] *Əlqərəz, arvad elə öz ayağı ilə yanıma gəlmişdi...* Ü.Hacıbəyov.

**ƏLQİSSƏ** *ara s.* [*ər.*] *klas.* b a x **əlqərəz**. *Əlqissə, vücudum oldu bərbad; Bir ləhzə fələkdən olmadım şad.* Füzuli. *Əlqissə, çoxdu canını qurban edən, çocuq! Ey dilbəranə tərzdə cövlan edən çocuq!* M.Ə.Sabir.

**ƏL-QOL** *is.* Əllər və qollar. *Əl-qolunu çırmalamaq.* – [Zənci:] *Zəncirlə bağlıdır mənim əl-qolum.* S.Vurğun. ☐ **Əli-qolu açılmaq** – geniş fəaliyyət göstərməyə imkan tapmaq, maneələrdən azad olmaq. *Amma ərə gedəndən sonra ..* [Tükəzbanın] *əli-qolu daha da açıldı və gəzib dolanmağı daha da artdı.* B.Talıblı. [Pəri:] *Hər halda Sara öldü, əlim-qolum açıldı.* C.Cabbarlı. **Əli-qolu bağlanmaq** – hərəkət azadlığından məhrum olmaq, heç bir şey edə bilməmək. **Əl-qol açmaq** – b a x **əli-qolu açılmaq**. *Yenə ayağa qalxıb əl-qol açdı və süzə-süzə Beyrəyə sarı gəlməyə başladı.* M.Rzaquluzadə. **Əl-qol atmaq** – 1) çapalamaq; 2) həyəcanla, əsəbi halda danışmaq, əl-qolunu oynatmaq, özündən çıxmaq. *Nə əl-qol atırsan?* – [Səfər:] *O yan-bu yana əl-qol atma, ay Xəlil.* S.Rəhman. *Kitabsatan bunları elə ucadan deyir, elə qəzəblə əl-qol atırdı ki, dalaşmağa adam axtardığını güman etmək olardı.* Mir Cəlal. **Əl-qol ölçmək** – əl-qolunu oynatmaq. *Rəhim bəy səbir edə bilməyib əl-qolunu ölçərək qışqırdı.* M.Hüseyn. [Mirzə Şəfi] *əl-qolunu ölçərək ifadəsini şiddətləndirirdi.* Mir Cəlal. **Əl-qolu gəlməmək** – həvəsi gəlməmək, istəməmək. *Əl-qolu gəlməyən, çəkilib matməəttəl qıraqda dayanan da olurdu.* Mir

Cəlal. **Əl(ini)-qolunu bağlamaq** – sərbəst hərəkət imkanından məhrum etmək, fəaliyyət göstərməsinə imkan verməmək. [Gülnisə:] *..Əvvəl çalışıb, Pərini Bəhrama verib əl-qolunu bağlamaq lazımdır.* C.Cabbarlı. *Sözün açığı budur ki, intriqa, çəkişmə, şəxsiqərəz sizin əl-qolunuzu bağlayıb işləməyə imkan vermir.* "Kirpi".

**ƏLQUŞU** *is.* 1. Əhliləşdirilmiş quş. // Ov quşu.

2. *məc. dan. zar.* Qucaqda saxlanmağa öyrənən, həddən artıq əzizlənib bəslənən uşaq haqqında.

**ƏLLAF** [*ər.*] bax **allaf**. *Əllaflar çuval-çuval arpa, buğda və saman alıb arabalara doldurur, eşşəklərə yükləyirdilər.* A.Şaiq. [Cəfərqulu:] *Yedi, içdi, axırıncı tikəsi ağzında idi ki, öz qəzalarından olan əllaf Məşədi Məmmədbağır içəri girdi.* Qantəmir.

**ƏLLAMƏ** *is.* və *sif.* [*ər.*] 1. Çox bilən, hər elmi bilən (adam).

2. *məc.* Yalançı alim. *Qınamasınlar məni; Hər şeydən xəbər verən əllamə tənqidçilər.* R.Rza.

3. *məc.* Bic, hiyləgər. *O, yaman əllamədir. – Anası heç qızından geri qalan deyildi. O da onun kimi əllamənin biri idi.* (Nağıl).

**ƏLLAMƏLİK** *is.* Özünü alim, bilici kimi göstərmə, alimlik satma. *Əllaməlik etmək. Bu əllaməlik nə üçündür? – Əllaməlik eyləyənlər bu yerlərə ayaq basmaz; Lakin sənin bu dağlardan yazdığına qələm çəkər.* S.Rüstəm. *Hacı Rəsul Tahirzadənin suallı baxışını görüb əllaməlik büruzə vermək istədi.* Mir Cəlal.

**ƏLLƏMƏ**[1] "Əlləmək"dən *f.is.*

**ƏLLƏMƏ**[2] *is. məh.* Daş, qaya.

◊ **Başına əlləmə düşsün** – qarğış ifadəsi. [Hürü:] *Evin yıxılsın, Mələk xanım, başına əlləmə düşsün, Mələk xanım, dincəldinmi?* N.Vəzirov.

**ƏLLƏMƏK** *f.* 1. Əllə yoxlamaq, əl sürtüb baxmaq, əl sürtmək, əl vurmaq, əl toxundurmaq. *Mirzə Rəhim ağa, Hacı xana mütəvəcceh olub gülə-gülə çənəsini əlləyirdi.* M.S.Ordubadi. *Bir əli ilə anasının döşündən möhkəm yapışmış körpə o biri əli ilə anasının üzünü, çənəsini əlləyirdi.* Ə.Vəliyev.

2. Əllə çağırmaq. *O, yoldaşını uzaqdan görüb əllədi.*

**ƏLLƏM-QƏLLƏM** *sif. dan.* Düz olmayan, qeyri-ciddi, etibar edilə bilməyən, cəncəl, hiyləbaz, fırıldaqçı, sözünün üstündə durmayan. *Əlləm-qəlləm adam.* – [İbrahim bəy:] *Bir Kərbəlayı Qulam var, əlləm-qəlləm, .. nadürüst, hacını yaman dolaşdırıb.* N.Vəzirov.

**ƏLLƏNMƏ** "Əllənmək"dən *f.is.*

**ƏLLƏNMƏK** *məch.* 1. Əllə yoxlanmaq, əllə sürtülüb baxılmaq.

2. Əllə çağırılmaq.

**ƏLLƏŞDİRİLMƏ** "Əlləşdirilmək"dən *f.is.*

**ƏLLƏŞDİRİLMƏK** *məch.* 1. Əllə yoxlanmaq.

2. Əllə qarışdırılmaq, axtarılmaq, tərpədilmək. *Gəlib gördüm ki, masanın üstündəki kağızlar əlləşdirilmişdir.*

**ƏLLƏŞDİRMƏ** "Əlləşdirmək"dən *f.is.*

**ƏLLƏŞDİRMƏK** *f.* 1. Bax **əlləmək** 1-ci mənada. *Qara Hüseyn, Nurəddinin qıçını əlləşdirib dedi..* S.S.Axundov.

2. Əllə qarışdırmaq, yoxlamaq, axtarmaq, tərpətmək. *Bu kağızları kim əlləşdirib bir-birinə qarışdırdı? – Müfəttiş kisənin qabağında oturub işləri əlləşdirdi.* S.Rəhimov. *Katibin qarşısındakı kağızları əlləşdirən Dövlət .. Veysin üzünə baxdı.* Ə.Əbülhəsən.

3. *icb.* Dalaşdırmaq, vuruşdurmaq, qapışdırmaq. *Uşaqları bir-biri ilə əlləşdirmək.*

**ƏLLƏŞMƏ** "Əlləşmək"dən *f.is.*

**ƏLLƏŞMƏK** *f.* 1. Çalışmaq, çalışıb-çapalamaq, bir şeylə məşğul olmaq. *Səhərdən axşama kimi əlləşdi, bu yazını yazdı. Nə qədər əlləşdimsə, bir şey çıxmadı. – Buludların .. günün şüasını bizdən aldığını, bizi məhrum etdiyini görüb biz əlləşərdik, çalışardıq ki, o namərbut qara buludları başımız üstündən rədd edək.* T.Ş.Simurq. *Fatma arvad hələ də təndir başında əlləşir.* Mir Cəlal. ☐ **Əlləşib-vuruşmaq** – çox çalışmaq, çox zəhmət çəkmək.

2. Çəkişmək, mübarizə etmək, deyişmək. *Sən onunla əlləşmə. – ..Yerdə qaçan şimşəyin; Çirmənib əlləşməyin; Carçısı mən olaydım.* Ə.Cavad. *Yaşar bu yarımcan qurdla əlləşməkdə ikən birdən yan-yörədən səs gəldi.* M.Rzaquluzadə.

**ƏLLƏŞ-VƏLLƏŞ: əlləş-vəlləş eləmək (olmaq)** *dan.* – bir-biri ilə güləşən kimi sarmaşıb əlləşmək.

**ƏLLƏTMƏ** "Əllətmək"dən *f.is.*

**ƏLLƏTMƏK** *icb.* Əllə yoxlatmaq.

**ƏLLİ**[1] Qırx doqquzdan sonra gələn rəqəm – 50. *Əlli adam. Əlli manat. Yaşı əllini keçmişdir. – Mahalda kənd bircədir; İçində əlli koxa.* (Bayatı). *Qafar yaşı əlliyə yaxın olan, xırdaca, arıq bir adamdı.* Ə.Əbülhəsən.

**ƏLLİ**[2] *sif.* 1. Əli olan. *İri əlli adam.*

2. *məc.* Qolu güclü, qüvvətli. *Həm ağanın özünə, həm də Zərrintac xanıma yad bir əl toxunmaması üçün möhkəm əlli bir mühafiz lazımdı.* S.Rəhimov.

3. *məc.* Cəld, əliiti, bacarıqlı. *Əlli adam.*

**ƏLLİ-AYAQLI** 1. *sif.* Diribaş, çox zirək, çox bacarıqlı, əlli-qollu. *Əlli-ayaqlı adam. – Laçın hələ yeddicə yaşında ikən çox diribaş, çevik, əlli-ayaqlı bir uşaqdı.* M.Hüseyn.

2. *zərf* İzsiz-soraqsız, tamam, bütün, büsbütün. *Əlli-ayaqlı itmək. – Naməlsəm məhəlləsindən üç adamı əlli-ayaqlı göndərdilər.* N.Nərimanov. [Nazlı:] ..*Cavan dayısı əlli-ayaqlı getdi..* Ə.Əbülhəsən.

**ƏLLİK** *is.* 1. B a x **əlcək**.

2. Bir şeyin əllə tutulan yeri, tutacaq, qulp, dəstə və s.

**ƏLLİQRAMLIQ** 1. *is.* Əlli qram ağırlığında olan çəki daşı. *Tərəziyə əlliqramlığı qoy.*

2. *sif.* Əlli qram ağırlığında olan, əlli qram tutan, çəkisi əlli qram olan. *Əlliqramlıq çəki daşı. Əlliqramlıq çay. Əlliqramlıq qutu.*

**ƏLLİLİK** 1. *is.* Əlli manatlıq kağız pul. *Əlliliyi xırdalamaq. Bir əllilik verdim, üç manat qaytardı. İki əllilik yüz manat edər.*

2. *sif.* Əlli manata dəyən, qiyməti əlli manat olan. *Əllilik kostyum* (*palto*).

3. *sif.* Çəkisi, həcmi, ölçüsü və s. əlli vahiddən ibarət olan. *Əllilik çən. Əllilik kisə.*

**ƏLLİMANATLIQ** b a x **əllilik** 1 və 2-ci mənalarda.

**ƏLLİNCİ** Qırx doqquzuncudan sonra gələn sıra sayı. *Əllinci adam. Əllinci illərdə. Əllinci sıra.*

**ƏLMƏNDƏ** *is.* Uşaq oyunlarından birinin adı.

**ƏLMUZDU** *is.* Əllə görülən işin haqqı, qarşılığı. [Məstəli şah:] *Xanım, divlərin əlmuzdusunu, ənamını kərəm edin.* M.F.Axundzadə. [Həkim] *də* [Qulamdan] ə*lmuzdu almadı.* S.Rəhimov. // Zərf mənasında. *Əlmuzdu işləmək.*

**ƏLSİZ** *sif.* 1. Əli, ya əlləri olmayan. *Bir Əlsiz adam.*

2. B a x **əlsiz-ayaqsız**. *Cəlil ağa özü keçmişdə fəqir olduğundan çox rəhmli idi və harada bir ittifaq düşsəydi, fəqirlərə, əlsizlərə kömək edərdi.* İ.Musabəyov.

**ƏLSİZ-AYAQSIZ** *sif.* və *is.* Bacarıqsız, aciz, yazıq, köməyə möhtac. *Əlsiz-ayaqsız adam.* – [Əmiraslan bəy:] *O, nizami qoşun deyil, əlsiz-ayaqsız .. kasıb-küsublardan toplanmış dəstədir.* S.S.Axundov. *Məni göndəribdir bura kəndin ağsaqqalları; Əlsiz-ayaqsızları,köməksiz yoxsulları.* S.Rüstəm. [Bəbir bəy:] *Mən əlsiz-ayaqsızlara kömək etmək istəyirəm.* Mir Cəlal.

**ƏLTOPU** b a x **həndbol**.

**ƏLÜSTÜ** *zərf* Tez, dərhal, o dəqiqə, o saat, dayanmadan, cəld, iti. *Əlüstü ayağa qalxdı. Əlüstü yola düşdüm. – Məhəmmədhəsən əmi əlüstü girdi həyətə.* C.Məmmədquluzadə. [Səfər:] *Ağa, mən də şəriət bilənəm ha... Çünki sözü deyən kimi əlüstü başa düşürəm.* C.Cabbarlı.

**ƏL-ÜZ** *top.* Əllər və üz. *Əl-üzünü silmək. Uşaq əl-üzünü rəngə buladı. – Qaraca qız paltarını geyib dedi*: *– Baba, əl-üzümü harada yuyum?* S.S.Axundov. [Pəri Cadu:] *Sən də get içəri, su töksünlər, əl-üzünü yu, bir az sərinləş.* Ə.Haqverdiyev. *Laçın, get su gətir, yoldaşlar əl-üzlərini yusunlar.* H.Nəzərli.

**ƏLÜZSİLƏN** *is.* Əl-üz silmək üçün dəsmal.

**ƏLÜZYUYAN** *is.* Əl-üz yumaq üçün xüsusi quruluşlu lüləyi olan alət. *Əlüzyuyanda boynunu yumaq. – Otaq pis deyil idi; student otağına məxsus hər bir şey var idi*: *yazı masası, kürsü, əlüzyuyan, çarpayı, hətta elektrik işığı da yerində idi.* Çəmənzəminli. [Nəriman] *..şapkasını təkyənin üstünə ataraq ağ, tüklü biləklərini çirməyib əlüzyuyana yaxınlaşdı.* İ.Əfəndiyev. *Fərman evinə iki yaxşı çarpayı, stol, stullar, paltar şkafı, kitab rəfi, əlüzyuyan və başqa avadanlıq almışdı.* Ə.Sadıq.

**ƏLVAN**[1] *sif.* [*ər.*] Cürbəcür rəngdə olan, rəngarəng, rəngbərəng, ala-bəzək. *Əlvan kağız. Əlvan çiçəklər. Əlvan tüklü quş. Əlvan parça. Küçələr əlvan lampalarla bəzənmişdir. – Bunlar əlvan qiyafəli, dünyanın hər*

*tərəfindən toplanmış dürlü xalqların birər nümayəndələri idilər.* H.Nəzərli. *Əlvan çiçək xalıları yamacda; Baş qaldırır nərgiz gözlü dolusu.* R.Rza.

**ƏLVAN²** *sif.* Dəmirdən başqa bütün materialların ümumi adı.

**ƏLVANBÜLBÜL** *is. zool.* Sərçələr dəstəsindən bəzəkli kiçik quş.

**ƏLVANÇIRAQ** *is.* Əlvan (rəngbərəng) lampalarla bəzənmiş şey.

**ƏLVANLIQ** *is.* 1. Əlvan şeyin halı, görünüşü; rəngbərənglik, rəngarənglik. *Çiçəklərin əlvanlığı.*

2. Əlvan bəzənmiş şey, yer və s. *Bayram münasibəti ilə şəhərin hər yeri əlvanlıqlarla dolu idi.*

**ƏLVERİŞLİ** *sif.* 1. Yararlı, münasib, uyğun, müvafiq. *Əlverişli üsul. Əlverişli şərait. Üzümçülük üçün əlverişli iqlim. Muğan pambıq əkini üçün ən əlverişli yerlərdəndir. – Səba xanım çox lazımi və əlverişli bir zamanda Həmədana gəldiyinə inandı.* M.S.Ordubadi. *Hüseyn əlverişli vəziyyətdədir; Bəs ataş açmayır, nə niyyətdədir?!* M.Rahim.

2. Gəlirli, xeyirli, faydalı, mənfəətli. *Əlverişli iş. – Şuşa şəhəri* [Rəşid üçün] *çox əlverişli* (z.) *oldu, yəni üç ay gəzəndən sonra əməlli-başlı sağaldı və kökəldi.* Ə.Vəliyev.

**ƏLVERİŞLİLİK** *is.* 1. Yararlılıq, münasiblik, uyğunluq, müvafiqlik, işəyararlılıq. *Yeni üsulun əlverişliliyi. Şəraitin əlverişliliyi.*

2. Gəlirlilik, xeyirlilik, faydalılıq. *İşin əlverişliliyi.*

**ƏLVERİŞSİZ** *sif.* Əlverişli olmayan, işə yaramayan. *Əlverişsiz şərait. Əlverişsiz iş.*

**ƏLVERİŞSİZLİK** *is.* Əlverişli olmama, işə yaramama.

**ƏLVİDA** *nida* [*ər.*] Sağlıqla qal, xudahafiz. *Əlvida, ey sevimli şəhər. – Əlvida! Əlvida! Daldığım uyğu; İnanmam ölümmü, röyamı yoxsa.* S.Vurğun. [Şəmsiyyə:] *Gözləyəcəyəm, müəllim, hələlik əlvida! – deyib getdi.* M.İbrahimov. ◻ **Əlvida etmək** – 1) görüşüb ayrılmaq, vidalaşmaq. *Dostlarla öpüşüb əlvida etdi. – Axır, gözüyaşlı anam, bacım və sair əqrəbam ilə əlvida edərək yola düşdüm.* S.S.Axundov. [Dərviş:] *Hamımız qoca kişi ilə bir yerdə kənddən əlvida edib şəhərimizə varid olduq.* A.Divanbəyoğlu; 2) *məc.* tərk etmək, itirmək, həmişəlik ayrılmaq. *Altı ay keçmədi ki, biçarə övrət də canından artıq sevdiyi kiçik balalarına həmişəlik əlvida etməyə məcbur oldu.* C.Cabbarlı. *Polad qərq olaraq düşüncələrə; Əlvida elədi ilk məhəbbətə.* M.Rahim. // Ayrılmaq, getmək münasibəti ilə düzəldilən mərasim. *Əlvida konserti.* // Ayrılıq, ayrılma. *Əlvida gecəsi.*

**ƏLYAZISI** b a x **əlyazma(sı)**. *Qədim əlyazısı.*

**ƏLYAZMA(SI)** *is.* Əl ilə yazılmış mətn, kitab və s; əlyazısı. *Əlyazmaları fondu* (əlyazmaları toplanılıb saxlanılan yer, idarə, şöbə və s.). *M.F.Axundzadənin əlyazmaları. Fondda ən qədim əlyazma perqament üzərində qədim kufi əlifbası ilə yazılmış Quran surəsidir.*

**ƏLYETMƏZ** b a x **əlçatmaz**.

**ƏLYÖVM** *zərf* [*ər.*] *klas.* 1. Bu gün, indi. *Yoxsa Məlikov Həsənbəyi-pir; Əlyövm olunur vətəndə təqdir?* M.Ə.Sabir.

2. Hələ də, indiyə qədər.

**ƏLZƏM** *sif.* [*ər.*] *klas.* Daha lazım, ən vacib, çox gərəkli. ◻ **Əlzəmdir** – lazımdır, çox vacibdir. *Əlbəttə, elm təhsil eləmək hər bir babətdən lazımdır və padşahi-mehribanımızın dilini bilmək dəxi əlzəmdir.* C.Məmmədquluzadə. *Hacı Rəsul*: *– Elm həm ünasa, həm zükura eyni dərəcədə əlzəmdir.* Mir Cəlal.

**ƏMAN** [*ər.*] b a x **aman**. *Böylə gedərsə Bakı əldən gedər; Qalmaz o məvadə əman, hiç, hiç!* M.Ə.Sabir.

**ƏMANƏT** *is.* [*ər.*] 1. Birinə inanıb bir şeyi müvəqqəti olaraq tapşırma, vermə. *Bu üzük sizdə əmanət qalsın.* ◻ **Əmanət almaq** – müvəqqəti istifadə üçün almaq. *Kitabı əmanət almışam.* **Əmanət vermək** – müvəqqəti istifadə üçün vermək. **Əmanət qoymaq** – bir şeyi müvəqqəti olaraq inandığı adama, ya yerə tapşırmaq, qoymaq. *Kağızlarını yoxladığım zaman sərrafların yanında yüz min tümən əmanət pul qoyduğunu gördüm.* M.S.Ordubadi. **Əmanət saxlamaq** – başqasının malını, pulunu müvəqqəti olaraq olduğu kimi qoruyub saxlamaq. // Saxlanmaq üçün birinə müvəqqəti olaraq tapşırılan şey, özgənin tapşırdığı şey. *Özgənin əmanətidir,*

*verə bilmərəm. – At elin, torba əmanət; Bizim daha nəyimiz var?* (Ata. sözü). *Qışda sorağını uzaqdan aldım; Dedim*: *– Əmanətim, eşqim səndədir.* N.Rəfibəyli. ◻ **Allah əmanəti, Allaha əmanət** – saxlamaq, qorumaq üçün müvəqqəti olaraq başqasına verilən qiymətli şey. *Ərz etdi: – Salamət ol, anacan! Allaha əmanət ol, anacan!* A.Səhhət. // *Sif. mənasında.* Əmanət qoyulmuş, müvəqqəti tapşırılmış. *Əmanət şey.*

2. Banka faizlə qoyulan pul. *Əmanətlərin qəbulu, verilişi.* ◻ **Əmanət kassası** – əhalinin artırıb yığdığı pulları müəyyən imtiyazlarla qoruyub saxlayan maliyyə müəssisəsi. *Pulunuzu əmanət kassasına qoyun. Əmanət kassası kitabçası. Əmanət kassasından pul götürmək.*

3. Bax **amanatabənd**. *Oturuşu o qədər əmanətdi ki, balaca bir təkanla onu arxası üstə aşırmaq olardı.* Ə.Əbülhəsən.

4. *nida köhn.* Allah eləməsin. *Əmanət, əmanət, dəyməsin ara; Düşməsin ədavət bir də dübara.* Q.Zakir.

**ƏMANƏTÇİ** *sif.* 1. Əmanət verən adam. // Əmanət kassasında pulu olan adam. *Əmanətçilərə xidmət.* – [Müstəntiq:] *Yox, sən qurtar get, indi uzaq kəndlərdən gəlmiş əmanətçilər kassa qabağındadırlar, sizi gözləyirlər.* S.Rəhimov.

**ƏMANƏTDAR** *is.* [*ər.* əmanət və *fars.* ...dar] 1. Əmanət saxlayan adam, əmanətçi.

2. *məc. klas.* Əmanət. *Dün Füzuli arizin görgəc, rəvan tapşırdı can; Laf edib derdi ki, canım var; əmanətdar imiş.* Füzuli.

**ƏMANƏTƏN** *zərf* [*ər.*] 1. Əmanət yolu ilə, əmanət olaraq.

2. Bax **amanatabənd**.

**ƏMANƏTİ** *sif.* 1. Əmanət olaraq verilən.

2. Bax **amanatabənd**.

**ƏMBİZ** *is.* Piramida şəklində yığılmış məhsul topası.

**ƏMCƏK** *is.* Məmə, döş. *Fəxrəddin!.. Mən səni bu əmcəklərimlə bəsləmişəm, Fəxrəddin!* N.Vəzirov. *İnəyin əmcəyindən çıxan süd balaca bulaq kimi şırhaşırla sərniclərə tökülürdü.* Ə.Vəliyev. ◻ **Əmcək uşağı** – südəmər uşaq. *Övrətlər əmcək uşaqlarını bağırlarına basıb tökülmüşdülər küçəyə.* C.Məmmədquluzadə. *Vaqonumuzun o başında bir əmcək uşağı hərdənbir ağlayırdı.* Ə.Haqverdiyev. **Əmcəkdən kəsmək** – süd verməyi dayandırmaq, süddən kəsmək, daha süd verməmək. *Uşağı əmcəkdən kəsmək.*

◊ **Anasının (nənəsinin) əmcəyini kəsən** – çox bic, fırıldaqçı, dələduz adam haqqında. *Bir şahıya nənəsinin əmcəyini kəsənlər var.* M.İbrahimov. **Anasının əmcəyini kəsmək** – fırıldaqçılıqla məşğul olmaq. *Adam da anasının əmcəyini belə kəsərmi?* S.Rəhman.

**ƏMCƏKLİ** *sif.* 1. Əmcəyi olan; məməli. *Cücə ağgünlü olsaydı, toyuq əmcəkli olardı.* (Ata. sözü.)

2. *məh.* Hələ sağılmamış. *İnək əmcəklidir.*

**ƏMDİRİLMƏ** "Əmdirilmək"dən *f.is.*

**ƏMDİRİLMƏK** *məch.* Əmməyə məcbur edilmək.

**ƏMDİRMƏ** "Əmdirmək"dən *f.is.*

**ƏMDİRMƏK** *icb.* Əmməyə məcbur etmək; döş vermək, döşdən süd vermək.

**ƏMƏK** *is.* İnsanın əqli və cismani gərginlik tələb edən məqsədəuyğun və ictimai cəhətdən faydalı fəaliyyəti; zəhmət. *Zehni əməklə fiziki əmək arasındakı ziddiyyətin aradan qalxması.* ◻ **Əmək aləti** – işləmək üçün lazım olan alət, karastı. **Əmək çəkmək** – bax **əmək qoymaq**. [Altunbay:] [Solmaza] *mən səni almaq üçün nə qədər əməklər çəkdim, altunlar tökdüm.* C.Cabbarlı. *Vəfalıya əmək çəksən itirməz; Bədəsil nəsihət, öyüd götürməz.* Xəstə Qasım. *Ata əmək çəkdi, bir bağ becərdi; Oğlu ordan şirin meyvələr dərdi.* M.Dilbazi. **Əmək haqqı** – zəhmət müqabilində alınan (verilən) pul, maaş və s. *Ayda nə qədər əmək haqqı alırsan? – Hər sahibkar öz istəyinə görə iş saatının müddətini və əmək haqqını təyin edir.* M.İbrahimov. **Əmək intizamı** – hər hansı bir kollektivin bütün üzvlərinin qoyulmuş olan qanun və qaydalara tabe olması zəruriyyəti. *Əmək intizamını yüksəltmək. – Bu zəngi Sübhanverdizadə əmək intizamını möhkəmləndirmək məqsədi ilə buraya vurmuşdu.* S.Rəhimov. **Əmək qabiliyyəti** – işləmək, iş görmək qabiliyyəti. *Əmək qabiliyyətini itirmək.* **Əmək qoymaq** – zəhmət çəkmək, zəhmət sərf etmək. *Bu işə çox əmək qoymuşam. – Əsədin sözünə nəzər yetirin; Yaxşı əmək qoyun, məhsul götürün.*

Aşıq Əsəd. **Əmək məhsuldarlığı** *iqt.* – vahid zaman ərzində fəhlənin istehsal etdiyi məhsulun miqdarı. **Əmək mükəlləfiyyəti** – əhalinin görməli olduğu ictimai, ya dövləti vəzifə. **Əmək-islah düşərgəsi** – məhbusların əməklə islah edildikləri cəza yeri. **Əməyi itmək (zay olmaq, əlində qalmaq, zaya getmək, bada getmək)** – zəhməti boşa getmək, zəhmətinin nəticəsini görməmək. [Koroğlu dedi:] *Əməyim zaya getməyi; Yandırır məni, yandırır.* "Koroğlu". *O zaman anladım itib əməyim; Qaldı bir də qiyamətə diləyim.* A.Səhhət. *Öz zəhmətimi demirəm, Gülqədəmin əməyi əlində qaldı.* Ə.Vəliyev. **Əməyi(m) gözündən gəlsin!** – qarğış ifadəsi. // Ümumiyyətlə, zəhmət, səy, cidd-cəhd. *Mən sizə yaxşılıq etmək fikrindəyəm, siz mənim əməyimi və cəfamı zaye etmək fikrindəsiniz!* M.F.Axundzadə. *Bu əmək hər yerdə torpağın üzünü eyni ehtirasla dəyişir.* M.İbrahimov.

◊ **Əmək kitabçası** – fəhlə və xidmətçinin əmək stajını göstərən sənəd (kitabça). **Əmək ordusu** *məc.* – əməkçilər, zəhmətkeşlər. **Əmək sazişi** – hər hansı bir işi görmək haqqında tərəflər arasında bağlanan müqavilə. **Əmək tərbiyəsi** – yetişən nəslin əmək əsasında tərbiyəsi sistemi. *Məktəblərdə əmək tərbiyəsini yüksək səviyyəyə qaldırmaq.*

**ƏMƏKÇİ** *sif.* Öz əlinin zəhməti ilə dolanan, öz əməyi ilə yaşayan, zəhmətkeş. *Əməkçi bəşəriyyət. – Haydı, əməkçi qız, gəl məni dinlə.* M.Müşfiq. *Əməkçi insanlar daim qardaşdır; Bir məslək uğrunda onlar sirdaşdır.* Z.Xəlil. // İs. mənasında. *Kənd və şəhər əməkçiləri.* – [Almaz:] *Yoldaşlar, bizim çalışdığımız kəndin əməkçiləri üçündür.* C.Cabbarlı. *Hər bir zaman əməkçilər çəkdi cəfamı.* Ə.Cavad.

**ƏMƏKÇİLİK** *is.* Əməklə keçinmə, zəhmətlə yaşama, zəhmətkeşlik.

**ƏMƏKDAR** *sif.* 1. Böyük xidmətləri olan. *Əməkdar alim.*

2. *rəs.* Elm, incəsənət, maarif, idman və s. sahəsində özünü göstərən qabaqcıl adamlara dövlət tərəfindən verilən fəxri ad. *Əməkdar artist. Əməkdar elm xadimi. Əməkdar idman ustası. Əməkdar müəllim. Əməkdar həkim. Əməkdar aqronom. Əməkdar inşaatçı.*

**ƏMƏKDARLIQ** *is.* 1. Bir işdə böyük xidmətləri olma.

2. *dan.* Əməkdar adı (b a x **əməkdar** 2-ci mənada). *Əməkdarlıq almaq.*

**ƏMƏKDAŞ** *is.* 1. Birisi ilə bir yerdə işləyən və ya ona kömək edən adam, iş yoldaşı. *Mənim əməkdaşım.* – [Elxan:] *Qorxmaz, zavallı əməkdaşlarım məhv oldular..* C.Cabbarlı. *Qəzaya getdikdə* [Eldar] *qızı əməkdaş sifəti ilə öz yanınca aparır.* S.Hüseyn.

2. Bir idarədə, müəssisədə çalışan şəxs, xidmətçi. *Əməkdaşların siyahısı. Əməkdaşların iştirakı vacibdir.*

3. Bəzi ixtisas işçilərinin adı. *Jurnal əməkdaşı.* // Elmi tədqiqat institutunda vəzifə adı. *İnstitutun elmi əməkdaşı.*

**ƏMƏKDAŞLIQ** *is.* 1. İşləmə, çalışma. □ **Əməkdaşlıq etmək** – 1) birinə kömək etmək. *Təcrübə işlərində professora əməkdaşlıq etmək;* 2) əməkdaş olmaq, işləmək. *Qəzetdə əməkdaşlıq etmək. Jurnalda əməkdaşlıq etmək.*

2. Birgə fəaliyyət, iş, birgə çalışma. *Hərbi əməkdaşlıq. Kosmosu tədqiq etmək sahəsində ölkələrin əməkdaşlığı.* □ **Əməkdaşlıq etmək** – birgə işləmək.

**ƏMƏKGÜN** *is. tar.* İşçilərin əməyini hesablama vahidi. *Kərim işləyən, öz işinin haqq-hesabını çox yaxşı bilən, bir əməkgününü itirməyən, əyriliyə qarşı vuruşan bir adam idi.* S.Rəhimov. [Qulu:] *Deyirəm, Cimi, vicdanın olsun, elə elə ki, mən də sənə əməkgünü yazanda utanıb tər tökməyim.* İ.Əfəndiyev.

**ƏMƏKÖMƏÇİ** *is. bot.* Uzun gövdəli, sünbül kimi iri parlaq rəngli çiçəkləri olan çoxillik bitki. *Payızlıq sovka tırtılları .. çil və əməköməçi bitkilərini çox sevir.* "Pambıqçılıq". □ **Əməköməçi fəsiləsi** *bot.* – bölümlüləçəkli ot və ağackimilərin daxil olduğu bitki fəsiləsi.

**ƏMƏKPƏRVƏR** *sif.* b a x **əməksevən**. *Əməkpərvər qız.*

**ƏMƏKSEVƏN** *sif.* Əməyi, zəhməti, işləməyi sevən, çalışqan. *Əməksevən xalq. – Əməksevən gənc nəsillər; Dönür şeyda bülbülə.* Aşıq Hüseyn. *Ana sevsin, əzizləsin; Əməksevən balasını.* M.Dilbazi.

**ƏMƏKSEVƏNLİK** *is.* Əməyi, zəhməti, işləməyi sevmə; çalışqanlıq. *Öz uşaqların-*

*da .. əməksevənlik, qayğıcıllıq sifətləri tərbiyə etmək hər bir ananın müqəddəs borcudur.*

**ƏMƏKSEVƏR** bax **əməksevən**. *O, çox əməksevər adamdır.*

**ƏMƏKSEVƏRLİK** bax **əməksevənlik**. *Əməksevərliyi ilə fərqlənmək.*

**ƏMƏKSİZ** *zərf* Zəhmət çəkmədən, işləmədən. *Əməksiz dolanır.* // *sif.* Zəhmətsiz, asan. *Əməksiz iş yoxdur.*

**ƏMƏL**[1] *is.* [*ər.*] İş, feil. *Onun sözü ilə əməli düz gəlmir.* – [Cənnətəli ağa:] *Onu bura çağır görüm, bu nə əməldir, mənim başıma gətirir.* N.Vəzirov.

2. İcra, yerinə yetirmə. □ **Əməl etmək (eləmək)** – yerinə yetirmək, icra etmək, riayət etmək. *Göstərişə əməl etmək. Təlimata əməl etmək. Həkimin göstərişlərinə əməl etmək. – Vaizi-şəhr öz iqrarına etsəydi əməl; Düşməz idi bu qədər din ilə dünyayə xələl.* S.Ə.Şirvani. *Sözlərinə əməl eləməyənə lənət!* N.Vəzirov. *Zeynal .. Mehriban və onun atasına verdiyi sözlərin heç birinə əməl etməyirdi.* S.Hüseyn. **Əməl olunmaq (edilmək)** – yerinə yetirilmək, riayət edilmək, icra olunmaq. *Qaydaya əməl olunur.* **Əmələ gəlmək** – 1) baş vermək, meydana gəlmək, doğulmaq, törəmək, hasil olmaq. *Bataqlıq durğun sudan əmələ gəlir. – Rəngarəng güllükdə, çəmənlikdə hamar və naxışsız bir ağlıq, bir düzənlik əmələ gəlmişdi.* S.Rəhimov; // mümkün olmaq, başa gəlmək, həyata keçmək. *Əmələ gələn şey deyil;* 2) kökəlmək, yaxşılaşmaq, qıvraqlaşmaq, düzəlmək. *Buzov süd əmə-əmə əmələ gəldi. O, kurortdan sonra əmələ gəldi. – Arvad məsləhət gördü ki, quzunu ötürsünlər, bir neçə vaxt bağçada otlasın, əmələ gəlsin.* C.Məmmədquluzadə. **Əmələ gətirmək** – 1) həyata keçirmək, yerinə yetirmək, icra etmək. [Hacı Mehdi:] *Bir təvəqqəm var, amma qorxuram, əmələ gətirə bilməyəsən.* Ə.Haqverdiyev. [Lütfəli bəy:] *Gözlərinə dönüm, .. gör necə mənim xahişlərimi əmələ gətirir?* İ.Musabəyov; 2) düzəltmək, vücuda gətirmək, təşkil etmək. [Əntiqənin] *özünün də qara, şəvə kimi saçları uzun və qalın bir hörük əmələ gətirmişdi.* Mir Cəlal.

3. Rəftar, hərəkət, iş. *Əməlləri ilə hamını özündən incitdi. Əz əməlinə görə cəzasını alacaqdır. – Elm insanlara eyni zamanda onların əxlaqını, rəftarını və əməlini yaxşılaşdırmaq üçün təcrübədən keçirilmiş bir vasitədir.* M.F.Axundzadə. *Sənə cəza verən əməllərindir.* M.Rahim. [Salmanova] *Cumanın .. bütün əməllərini gözünün içinə deyəcəkdi.* Ə.Əbülhəsən.

4. *məc.* Hiylə, kələk, biclik mənasında. *Bu sənin əməlindir. – Xalq bir-bir gedib öpürlər əlin; Anlamaz kimsə hiyləsin, əməlin.* A.Səhhət. *Bir neçə kazak əsgərləri də onların dalınca gedirlər ki, görsünlər bu nə əməldir.* C.Məmmədquluzadə. *Əlbəttə, şeytan əməlinə qurşanan gərək axırda belə olsun.* Ə.Haqverdiyev.

5. Hesabda tətbiq edilən əsas qayda. *Hesabda əsas dörd əməl var: cəmləmə, çıxma, vurma, bölmə.*

◊ **Əməli azmaq** – pozğunlaşmaq, yoldan çıxmaq, həddini azmaq. **Əməli ayağına cidar olmaq** – gördüyü işin cəzasını çəkmək, pis nəticəsini görmək.

**ƏMƏL**[2] *is.* [*ər.*] Qayə, məqsəd, şiddətli arzu. [Ağa Bəşir:] *Bilirsinizmi ki, dünən şikayətə gələn arvadın əməli nə imiş?* M.F.Axundzadə. *Əməli, fikri bütün kəsbi-kamal; Nə müqəddəs əməlü fikrü xəyal!* M.Hadi. *Min bir əməl arxasınca qoşmağı; Dürlü-dürlü ürəklərdən öyrəndim.* M.Müşfiq.

**ƏMƏLBAZ** *sif.* [*ər.* əməl və *fars.* ...baz] *dan.* Tədbirli, tədbir və hiylə ilə iş görən, hiyləgər. *Əməlbaz adam. – Demək, bu əməlbaz arvad oturduğu yerdə həm qızını sözsovdan qurtardı, həm də bu vilayətin böyüyü elədi.* S.Rəhimov.

**ƏMƏLBAZLIQ** *is. dan.* Hiyləgərlik, tədbirlilik, tədbir və hiylə ilə iş görmə. □ **Əməlbazlıq etmək** – tədbir və hiylə ilə iş görmək, hiylə işlətmək.

**ƏMƏLDAŞ** *is.* Əməli, məqsədi, qayəsi bir olan, bir məqsəd arxasınca qoşan adamlardan hər biri. *Toplayaraq başına öz əməldaşlarını; Qoydu böyük firqənin ilk təməl daşlarını.* R.Rza.

**ƏMƏLƏ** *is.* [*ər.*] Fəhlə, işçi. *Molla .. çıxıb gedəndə hamampulunu on-on beş qat artıq verir, hamamçını da, əmələləri də utandırır.* "M.N.lətif". [Odabaşı:] *Neçə yüz əmələ onun fabrikində və kəndlərində iş-*

*lərdi.* Ə.Haqverdiyev. *Xanlar Həsənoğluna atılan güllə tək bir ona yox, biz neft əmələsinin hamısına atılıbdır.* S.Rəhimov.

**ƏMƏLƏCAT** *is.* [*ər.* "əmələ" söz. cəmi] *köhn.* İşçilər, fəhlələr, əmələlər. ..*İdarəsində çalışdırdığı əmələcatını da özü kimi pak, etiqadlı, dindar bir müsəlman görmək istərdi.* S.Hüseyn.

**ƏMƏLƏGƏLMƏ** *is.* Yaranma, düzəlmə. *Molekulun əmələgəlmə istiliyi.*

**ƏMƏLİ** *sif.* 1. İcrası (tətbiqi) lazım olan, həyata keçirilməli olan; işgüzar, praktik. *Əməli təklif. Əməli iş. – Mən dərhal onunla əməli söhbətə başladım.* M.S.Ordubadi.

2. Sırf nəzəriyyəyə, elmə aid olmayıb işlə, əməliyyatla, təcrübə və tətbiq ilə də bağlı olan; tətbiqi, praktiki. *Aktyor sənətinin əməli məktəbi. Əməli işin elmi tədqiqat işi ilə əlaqələndirilməsi. Lüğətçiliyin nəzəriyyəsini bilmək kifayət deyil, onun əməli cəhətini də bilmək vacibdir.*

3. Yalnız sözlə deyil, işlə, əməllə olan. ..*Zavodun kollektivi respublikanın bəzi uşaq evlərinə hamilik edərək, onlara əməli yardım göstərir.*

◊ **Əməli katib** – cari yazı işlərini aparan katib; kargüzar. *Daldaya gələndə isə, əziz dostu, arası saz olduğu əməli katibin dediklərini xatırlardı.* Mir Cəlal.

**ƏMƏLİSALEH** *sif. dan.* Əməlində, işində, hərəkətində düz olan, doğru hərəkət edən, əyriliklə işi olmayan (adətən istehza, kinayə və ya zarafatla deyilir). *Əməlisaleh adam. Bunu əməlisaleh adamlar bilər. – İndi bilmirəm, sən necə əməlisaleh adamsan ki, yenə də məni adam elədin.* "M.N.lətif." [Qarı:] *A qız, Çimnaz, ey! Sən ki əməlisaleh kişinin qızısan, özün də yazığın biri! Necə oldu ki, axı uşağını qoydun onlara qoşuldu?* Ə.Əbülhəsən. // is. mənasında. *Əməlisalehlər cənnətə və bədəməllər cəhənnəmə daxil olacaqlar.* C.Məmmədquluzadə.

**ƏMƏLİYYAT** *is.* [*ər.* "əməliyyə" söz. cəmi] 1. Müəyyən bir məqsəd güdən və bir-biri ilə əlaqəli olan işlər. *Təmizləmə əməliyyatı. – Qulu Bəhramın vasitəsilə bəzi əməliyyat yapmaq fikrində idi.* Çəmənzəminli.

2. *tib.* Bəzi xəstəliklər, yaxud yaralanmalar zamanı müalicə məqsədi ilə bədənin hər hansı bir yerində icra edilən cərrahlıq işi. *Cərrahlıq əməliyyatı. Plastik əməliyyat.*

3. Müharibədə bir məqsədi, tapşırığı yerinə yetirmək üçün aparılan döyüş işləri. *Hərbi əməliyyat. Hücum əməliyyatı. Mühasirə əməliyyatı. Quruya qoşun çıxarma əməliyyatı. – ..Dəstə .. əməliyyatdan qayıdıb dincəlməkdə idi.* Ə.Əbülhəsən. *Müharibə dövründə toplarımız hücum əməliyyatının carçısı olmuşdur.* (Qəzetlərdən).

4. Maliyyə, ticarət idarəsinin gördüyü işlərin məcmusu. *Bank əməliyyatı. Kredit əməliyyatı. Mal mübadiləsi əməliyyatı. Birja əməliyyatı.*

**ƏMƏLLİ** *sif.* və *zərf* Yaxşı, layiqli, ləyaqətli. *Əməlli hədiyyə. Əməlli işləmək. –* [Mozalanbəy:] *Ancaq "Molla Nəsrəddin" qəzetinin yazısını gözüm əməlli seçmir.* Ə.Haqverdiyev. [Əcəb xalanın] *nə gözü yaxşı görürdü, nə də qulağı əməlli eşidirdi.* S.Hüseyn. // Qaneedici, təminedici, məmnunedici, məqbul. *Ondan əməlli bir cavab ala bilmədik. –* [Səftərqulu:] *Yoxsa yenə içmisən, a gedə? Əməlli danış, elə iş ola bilməz!* N.Vəzirov. [Yusif:] *Və bir elə ittifaq düşməyib ki, mən* [Şamdan bəyi] *əməlli tanıyam.* N.Nərimanov.

**ƏMƏLLİ-BAŞLI** *sif.* və *zərf* Olduqca yaxşı, bütün tələbata cavab verən, mükəmməl, nöqsansız, bütün, tam, ciddi. *Əməlli-başlı bir şey. Əməlli-başlı bir usta tapmaq. Əməlli-başlı işləmək.* // Əsaslı surətdə, lazımınca, lazımi kimi, istənildiyi kimi. *Heç bir şeyi əməlli-başlı demir. – Pəri burada əməlli-başlı məclis qurdu, yemək-içmək düzəltdi.* (Nağıl). [Sitarə xanımın] *əməlli-başlı kirayə gətirən evi də vardı.* S.Hüseyn. [Koxa:] *Siz cavab axtarın, mən də əyləşim; Bir əməlli-başlı bığımı eşim.* S.Rüstəm. *Çimnaz yüngül adam olsaydı, bu qarı ilə elə buradaca əməlli-başlı tutuşa bilərdi.* Ə.Əbülhəsən. // Mükəmməl surətdə, olduqca, lap. *Qara kişini bu soyuq hava üşütdü, nəşəsini əməlli-başlı korladı.* Ə.Əbülhəsən.

**ƏMƏLLİCƏ** bax **əməlli-başlı**. *Əməllicə geyinmək. Əməllicə bina. Əməllicə yemək. Əməllicə yorulmaq. Bu gün əməllicə işlədik. Çox yaxşı olar, gündüz əməllicə yorulmuşam, – deyə* [dostumun] *təklifini şadlıqla qəbul etdim.* M.Rzaquluzadə.

**ƏMƏLPƏRVƏR** *is.* [*ər.* əməl və *fars.* ...pərvər] *klas.* Müəyyən bir əməl (qayə, məqsəd) uğrunda çarpışan, konkret bir məqsədə xidmət edən. *Mirzə Fətəli bir ədib və bir naşir olmaqdan daha artıq bir cəmiyyətçi, bir əməlpərvərdi.* C.Cabbarlı.

**ƏMƏLSİZ** *sif.* Sözünə, vədinə əməl etməyən, yaxud bir şeyə inandığı halda, onu yerinə yetirməyən, ona əməl etməyən. *Əməlsiz nəsihətçi. Əməlsiz adam.* // Əməli əhəmiyyəti olmayan, həyata keçməyən. *Əməlsiz sözdə fayda olmaz.* (Ata. sözü). // Dini ehkama sözdə inanıb, işdə onları yerinə yetirməyən, onlara əməl etməyən. *Əməlsiz müsəlman. – Məni yarsız görmə, mənim pərim var; Əməlsiz deyiləm, haqdan karım var.* Aşıq Rəcəb.

**ƏMƏZƏK** *sif.* 1. Anasını əmməmək, yaxud əmə bilməmək nəticəsində arıq olan; zəif, cılız. *Əməzək quzu. Əməzək adam kimi tərpənir.*

2. *məc.* Key, maymaq, qorxaq, bacarıqsız. [Bahar:] *Ay əməzək, Allah səni döysün! Niyə qoyurdun qaçsın, indi nə tövr eləyək?* Ə.Haqverdiyev.

**ƏMGƏK** *is.* Kəllə sümüyünün ön və orta hissəsi. *Qiyas əmgəyindən peysərinə qədər qırxılmış .. başını əlləri ilə tutdu.* Ə.Abasov.

**ƏMİ** *is.* 1. Atanın qardaşı. *Çünki Fərəc xan Bağır xanın əmisi oğlu və damadıdır, heç bir əmrdə onun rəyinə müxalifət etməz.* M.F.Axundzadə. *..Əmiləri dövləti bir ilin içində dağıtdılar, axırda bir barmaqhesabı göstərdilər.* C.Məmmədquluzadə.

2. Yaşlı, yaxın adama müraciət kimi işlədilən söz. *Əmi, saat neçədir?* – [Sona:] *Əmi, bizim bu Qadir yaman qorxur.* Ə.Əbülhəsən. // Hörmət üçün özündən yaşlı kişinin adına qoşulur. *İki saat yol gedib Qasım əmi yetişdi Təzəkəndə...* C.Məmmədquluzadə.

**ƏMİARVADI** *is.* Əminin arvadı.

**ƏMİCAN(I)** b a x **əmidostu**.

**ƏMİCİ** *sif.* 1. Əmən, soran. *Əmici uşaq.*

2. Xüsusi terminologiyada: sorucu, soran, xüsusi orqanları vasitəsilə içəriyə çəkən. ☐ **Əmici tel** – bitkinin kökündə olan incə, sorucu kökcük. *Kökün əmici telləri uzun ömür sürmür.*

**ƏMİDOSTU** *is.* 1. Əmiarvadı yerində işlənən ləqəb. [Şahbaz bəy:] *Şərəfnisə, qadan alım, bilirsən ki, əmidostum bu gün nə tufan elədi?* M.F.Axundzadə. [Rəşid:] *Dünən bizim başımız yaman qarışıq oldu, əmidostu!* M.Hüseyn.

2. Özgə qadını hörmətlə çağırmaq üçün işlənən ləqəb. *Əmidostu, bu uşaq kimlərdəndir?*

**ƏMİGƏLİNİ** *is.* 1. Hörmət üçün əmi arvadına verilən ləqəb.

2. Əmioğlunun arvadının ləqəbi olan ad.

**ƏMİK** *sif.* Çox əmilməkdən xarab olmuş, zədələnmiş.

**ƏMİQIZI** *is.* 1. Əminin qızı. *Tamam da əmiqızının uşağını saxlayacaqdır.* S.S.Axundov. // Əminin qızına müraciət. [Bəhram:] *Xoş gördük, əmiqızı, yəqin məni çox gözləmisən.* C.Cabbarlı. [Tahir:] *Yox, əmiqızı, qızdırmanın qalxmağı ondan deyil.* M.Hüseyn.

2. *məc.* Özgə qızlara hörmət və mehribanlıq göstərərək, çağırmaq üçün işlənən ləqəb.

**ƏMİLMƏ** "Əmilmək"dən *f.is.*

**ƏMİLMƏK** "Əmmək"dən *məch.*

**ƏMİN** *sif.* [*ər.*] 1. Qorxusuz, xətərsiz, etibarlı, dinc, sakit. *Əmin yol. Əmin yer.*

2. Tamamilə xatircəm, arxayın, qane. *Bu işin baş tutacağına biz əminik.* – [Məhərrəm:] *Mən əminəm ki, Səriyyə heç vaxt razı olmayacaq və Rüstəmdən ayrılmayacaq.* C.Cabbarlı. *İzzət qarı əmin idi ki, .. o gülün kökünü qazıb çıxarmaq lazımdır.* Ə.Məmmədxanlı. ☐ **Əmin etmək** – inandırıb rahat etmək, tamamilə inandırmaq, xatircəm etmək, arxayın etmək, inandırıb qane etmək. *Mən sizi əmin edə bilərəm ki, o yazıq gənc təmiz bir adamdır.* M.S.Ordubadi. *Budur, mən səni öz tərəfimdən əmin edirəm..* H.Nəzərli. **Əmin olmaq** – tamamilə inanmaq, inanıb rahat olmaq, xatircəm olmaq, arxayın olmaq. *Siz buna əmin ola bilərsiniz. – Mina cavab verdi ki, əmin olunuz, əzizim!* İ.Musabəyov.

3. İnanılacaq, inanıla bilən, düz, etibarlı. *Əmin adam.*

**ƏMİN-AMANLIQ** *is.* Sakitlik, asayiş, bir yerdə qayda və nizamın hökm sürdüyü hal. *Nədənsə sizin dəstəniz Təbrizə girdiyi gün-*

*dən bəri əmin-amanlıq yarada bilmədi.* M.S.Ordubadi. *Müşavirənin gedişindən görünürdü ki, heç bir qəzada əmin-amanlıq yarana bilməmişdir.* S.Rəhimov.

**ƏMİN-ARXAYIN** *sif.* və *zərf* Sakitcə, rahatca, arxayınca. *Bir dəqiqə çəkmədi ki, qara əjdaha ləhləyə-ləhləyə çaparaq, yüyürərək platforma qabağında əmin-arxayın dayandı.* S.M.Qənizadə.

**ƏMİNƏVƏSİ** *is.* Əminin oğlunun və ya qızının oğlu (qızı).

**ƏMİNLƏŞMƏ** "Əminləşmək"dən *f.is.*

**ƏMİNLƏŞMƏK** *f.* 1. Qorxusuz (təhlükəsiz) hala gəlmək. *Səngər dalına girib əminləşmək.* // Asayiş düşmək, əmin-amanlıq düşmək.

2. Arxayınlaşmaq, xatircəmləşmək, rahat olmaq. *Oğlundan məktub alandan sonra əminləşdi.*

**ƏMİNLİK** *is.* 1. Sakitlik, əmin-amanlıq, qorxusuzluq.

2. Xatircəmlik, arxayınlıq.

**ƏMİOĞLU** *sif.* 1. Əminin oğlu. *Qızlar şərti pozan əmioğlunu danladılarsa da, yenə gülüşməyə məcbur oldular.* M.Hüseyn.

2. Özündən yaşlı əmisi oğluna, yaxud başqa bir adama müraciət sözü. *Əmioğlu, bir bura zəhmət çək.* – [Sara:] *Bəhram! Əmioğlu, özün bilirsən ki, mənim dünyada bir kimsəm yoxdur.* C.Cabbarlı.

**ƏMİR** *sif.* [*ər.*] 1. Bir tayfanın və ya ölkənin başçısı. *Qəbilənin əmiri.* – *Şairin qəzəllərinə məftun olmuş Dərbənd əmiri onu bu xaraba kənddən öz sarayına dəvət edir.* Ə.Məmmədxanlı.

2. *tar.* Bəzi Şərq hökumətlərinin başçılarına və yüksək vəzifəli şəxslərə rəsmi olaraq verilən ad. *Qabaq cərgələrdə əmirlər, vəzirlər və kübar ailələr yerləşmişdi.* M.S.Ordubadi.

**ƏMİRAXUR** *is. tar.* b a x **miraxur**.

**ƏMİRİ** *sif.* 1. Əmirə mənsub, məxsus olan.

2. *məc.* Ən yaxşı, ən əla mənasında. *Əmiri xörək. Əmiri paltar.*

◊ **Əmiri papaq** *köhn.* – dəridən tikilən hündür papaq növü. *Başında əmiri papaq vardı.*

**ƏMİRLİK** *is.* 1. Əmir vəzifəsi.

2. Əmirin idarəsi altında olan yerlər, ölkə.

**ƏMİRÜLÜMƏRA** *is.* [*ər.*] *tar.* Əmirlər əmiri (xəlifələr dövründə yüksək rütbə adı).

**ƏMİR-ÜMƏRA** *top.* [*ər.*] Əmirlər. *Vəzir, vəkil, əmir-ümərа nə qədər çox dedi, Şah Abbas az eşitdi.* (Nağıl).

**ƏMİŞ** *is.* 1. Əmmək işi, əmmə prosesi. *Quzuların əmişi.* – *Zəng çalınanda, əmişdən sonra ayrılan qoyun-quzu kimi uşaqlar böyüklərdən ayrıldılar.* Mir Cəlal.

2. Əmmə vaxtı. *Əmiş yaxınlaşanda quzuları ağıldan çıxardırlar. Qoyun əmişində gəl, süd apar.*

**ƏMİŞDİRİLMƏ** "Əmişdirilmək"dən *f.is.*

**ƏMİŞDİRİLMƏK** *məch.* Əmizdirilmək, əmişə salınmaq (çoxları haqqında). *Qoyun və quzular əmişdirildi, sonra qoyunlar sağılmağa başlandı.*

**ƏMİŞDİRMƏ** "Əmişdirmək"dən *f.is.*

**ƏMİŞDİRMƏK** *f.* Quzuları analarını əmişməyə buraxmaq, əmizdirmək. *Quzuları çobanlar əmişdirdilər.* – *Azərbaycanda və ümumiyyətlə, Zaqafqaziyada bir qayda olaraq camışları balaları əmişdirməklə sağırlar.* A.Ağabəyli.

**ƏMİŞMƏ** "Əmişmək"dən *f.is.*

**ƏMİŞMƏK** *f.* Kütləvi halda analarını əmmək. *Quzular* (*buzovlar*) *əmişirlər.*

**ƏMİUŞAĞI** *is.* Əminin oğlu, ya qızı. *O, bizimlə əmiuşağıdır.*

**ƏMİZADƏ** [əmi və *fars.* ...zadə] *köhn.* 1. B a x **əmiuşağı**. *O mənim əmizadəmdir.* – [Pəricahan xanım:] *Ah, harada qalmışsan, ey sevgili əmizadəm!* S.S.Axundov. *Hatəm xanın əmizadəsi Yədulla xan evdə işsiz oturmaqdan çox darıxdığı üçün bir ziyafət düzəltmək qərarına gəldi.* S.Rəhimov.

2. Ata-babanın əmiləri nəslindən olan. *Onlar bizim əmizadələrimizdir.* – *Tağı əmi sair əmizadələrinə nisbətən məndə böyük təsir buraxmışdı.* S.S.Axundov.

**ƏMİZDİRİLMƏ** "Əmizdirilmək"dən *f.is.*

**ƏMİZDİRİLMƏK** *məch.* Döşdən süd verilmək.

**ƏMİZDİRMƏ** "Əmizdirmək"dən *f.is.* *Əmizdirmə zamanı.*

**ƏMİZDİRMƏK** *f.* Döşdən süd vermək. *Ana körpəsini əmizdirir.* – *Əvvəl əmizdirir öz körpəsini; Uşaq gülümsəyib kəsir səsini.* S.Vurğun. *Nərgiz quymaq yedi və uşağı əmizdirdi.* Ə.Vəliyev.

**ƏMİZDİRTMƏ** "Əmizdirtmək"dən *f.is.*

**ƏMİZDİRTMƏK** *icb.* 1. Bax **əmizdirmək**. *Uşağı əmizdirtdinmi?*

2. Əmməsinə imkan vermək. *İnəyi əmizdirtdi.*

**ƏMİZMƏ** "Əmizmək"dən *f.is.*

**ƏMİZMƏK** bax **əmizdirmək**.

**ƏMLAK** *is.* [*ər.* "mülk" söz. cəmi] 1. Mülklər (torpaq, əkin yerləri, malikanə və s.). [Mirzə Kərim:] *Dövlətlilərin mal, əmlakı keçir ümum camaat ixtiyarına.* Ə.Haqverdiyev.

2. Birinin sahib olduğu pula dəyər şeylərin, varın, mal və mülkün məcmusu. *Dövlət əmlakı. Cinayətkar əmlakı müsadirə olunmaqla cəzaya məhkum olundu. – Dövlətliyik, əlbəttə, şərafət də bizimdir; Əmlak bizimdirsə, əyalət də bizimdir.* M.Ə.Sabir.

**ƏMLİK** *is.* Yenicə ota düşən və eyni zamanda anasını əmən quzu, keçi. *Əmliklər çəkdirəm şişə; Bir ağır yığnağım ola!* "Koroğlu". *Bir əmliyin bir tümənə satılır; Xəzəl oldu yenə pulların, dağlar!* Aşıq Ələsgər. *Gəl oturma belə tək; Kürdə bir əmlik kəsək.* M.Rahim. // Sif. mənasında. *Əzizim, bahar barı; Şirindir bahar barı; Kəsmə əmlik quzunu; Qoy gəlsin bahar, barı.* (Bayatı). *Yaylağın sərin havası, əmlik quzunun əti kazakları kefləndirib şirin yuxuya vermişdi.* "Qaçaq Nəbi". *Yaxşı əmlik quzu kəsmişəm, çox gözəl İsfahan şərabı da vardır.* M.S.Ordubadi. □ **Əmlik kimi** – bəslənmiş quzu kimi, lap gənc, gözəl, şux. *Yalan ha deyil, bəxtli olmasan, belə əmlik kimi qızı almazdın.* A.Şaiq. [Uşaqlar] .. *bəslənmiş əmlik kimi analarının yanına düşüb yüyürürdülər.* Mir Cəlal.

**ƏMMA** [*ər.*] 1. Bax **amma**. *Şeir bir zivərdir, əmma biz kimi naqislərə; Ol ki naqisdir, onu möhtaci-zivər qılmamış.* Füzuli. *Çox kimsənin əgər ki kəsibdir qərarını; Əmma mənim təki o gülün biqərarı yox.* S.Ə.Şirvani.

2. Bir şeyə mane olan, əngəl törədən keyfiyyət, hal, səbəb. *Burada bir balaca əmma var. – Yusif huşi-guşinən qulaq asıb gördü: adə, deyəsən, burda bir əmma var.* (Nağıl). *Bəs bu gözəllikdə otaqları beş yüz manata alanda demədinmi bunun əmması var?* Mir Cəlal. □ **Əmması çıxmaq (olmaq)** – 1) nöqsanı, əgər-əskiyi olduğu məlum olmaq; 2) sonradan xatası çıxmaq, əngəli çıxmaq.

**ƏMMAMƏ** *is.* [*ər.*] Bəzi Şərq ölkələrində: sarınmış uzun ağ parça, yaxud tirmə zolağından ibarət baş geyimi; sarğı; çalma. // Axundların və başqa ruhanilərin başlarına qoyduqları bu cür sarğı. *Elə ki tək qaldılar, Koroğlu abanı, əmmaməni çıxardıb bir tərəfə tulladı.* "Koroğlu". *Molla İbrahimxəlil sabah vaxtı səccadə üstündə, başında əmmamə, əlində uzun təsbeh, dizi üstə oturub övrad oxumağa məşğuldur.* M.F.Axundzadə. *Qoydun əmmamə başına, dandın həqiqəti; Alati-həcvü məsxərə qıldın şəriəti.* Ə.Qəmküsar.

**ƏMMAMƏDAR** [*ər.* əmmamə və *fars.* ...dar] bax **əmmaməli**. [Baş nazir:] *Bu əmmamədarlar hamıdan bədtərdirlər.* P.Makulu.

**ƏMMAMƏLİ** 1. *sif.* Başında əmmamə olan. *Bunlar keçəndən sonra əmmaməli həşəratı nə eləyək?* C.Məmmədquluzadə. *Mənim əmmaməli yoldaşım birdən ucadan müsəlmanca səsləndi.* Ə.Haqverdiyev. *Sonra da bir tirmə əmmaməli molla gəlib salam verdi.* Mir Cəlal.

2. *is.* Ruhani, molla, seyid və b.

**ƏMMƏ[1]** *is.* [*ər.*] *klas.* Bibi. *Aya, onlar deyil idi ki, analarını, bacılarını və qızlarını və əmmələrini və xalələrini nikah edərdilər.* M.F.Axundzadə. [Pəricahan xanım:] *Biçarə əmməm şam kimi əriyir.* S.S.Axundov.

**ƏMMƏ[2]** "Əmmək"dən *f.is.*

**ƏMMƏK** *f.* 1. Dodaq və dilin müvafiq hərəkəti vasitəsilə döşdən südü soraraq içmək. *Quzular qoyunları əmirdilər. Uşaq anasını əmir. – Südünü əmmişəm mən qana-qana; Ana, mən yazığı nə dindirirsən?* "Aşıq Qərib". *Aslan gah əmir, gah da döşdən ayrılıb hıçqırırdı.* Ə.Vəliyev. // Bir şeyi ağzına salıb sormaq, sümürmək. *Barmağını əmmək.*

2. *məc.* Qidalanmaq, qüvvət almaq. *Daşlar yarılanda günün telindən; Əmərsən dağların qarlı selindən.* S.Vurğun. *Bahar çağı güllər günəş əməndə; Görüş təyin eləmişəm çəməndə.* M.Rahim.

◊ **Anadan əmdiyi süd burnundan (burnunun dəliklərindən) gəlmək** – olmazın əziyyət və əzablara məruz qalmaq,

əziyyət və əzab çəkmək. *Zeynəb Xudayar bəyin evində altı ay yarım qaldı. Və bu altı ay yarımın ərzində Zeynəbin anadan əmdiyi süd burnunun dəliklərindən gəlib töküldü.* C.Məmmədquluzadə.

**ƏMN** *is.* [*ər.*] *klas.* Əminlik, əmniyyət, asayiş, sakitlik. // Rahatlıq, asudəlik. *Meyxanədir, Füzuli, cəhanda məqami-əmn; Cəhd et, bir ev hübab kimi onda tut məqam.* Füzuli.

**ƏMNİYYƏ** *is.* [*ər.*] İranda: jandarm, polis (məmuru). *Bir anda əmniyyələr soxuldular otağa; Hamısı çəkib birdən tüfəngləri ayağa.* S.Rüstəm. *Ərdəbildə Hikmət İsfahaninin kəndlərindən birində kəndçilər üsyan edib əmniyyəni öldürmüşlər.* M.İbrahimov. // Polis idarəsi, jandarm idarəsi.

**ƏMNİYYƏBAŞI** *is.* İranda: polis başçısı, jandarm başçısı.

**ƏMNİYYƏT** *is.* [*ər.*] 1. Təhlükəsizlik, qorxusuzluq, əminlik, sakitlik, ictimai asayiş. *Düşmən sərhədimizdən nə qədər uzaqda olsa, səadət və əmniyyətimiz də o qədər yaxınımızda olar.* M.S.Ordubadi.

2. *xüs.* Qoruyucu. *..Elektrik xətlərini çox diqqətlə yoxlamaq, vaxtlı-vaxtında təmir etmək və əmniyyət cihazlarının sayını artırmaq lazımdır.* M.Hüseyn.

3. İnanma, etimad, etibar.

**ƏMNİYYƏTLİ** *sif.* Qorxusuz, əmin, sakit. *Əmniyyətli yer.*

**ƏMNİYYƏTSİZ** *sif.* 1. Əmniyyət və asayişi olmayan; qorxulu və təhlükəli olan. *Əmniyyətsiz yer.*

2. Etibarsız, inanıla bilməyən, bel bağlana bilməyən.

**ƏMNİYYƏTSİZLİK** *is.* 1. Əmniyyət və asayiş olmadığı hal, vəziyyət.

2. Etibarsızlıq, inanıla bilməmə, bel bağlana bilməmə.

**ƏMR**[1] *is.* [*ər.*] 1. Bir işin görülməsi üçün verilən hökm, göstəriş. [İskəndər:] *Gərək hər əmrimə baş əysin cahan; Ovcumda top kimi oynasın dövran.* A.Şaiq. *..Müqim bəy xanımın tapşırığını bir əmr kimi yerinə yetirmişdi.* S.Rəhimov. ◻ **Əmr etmək** – bir işin görülməsini hökmlə tapşırmaq, buyurmaq. *Onun eşqiylə mən ki dərbədərəm; Hər nə əmr etsəniz qəbul edərəm.* H.Cavid. *..Mənə də müəllimimiz .. bir hekayə düzəldib yazmağı əmr etmişdi.* S.S.Axundov. // Bir işi yerinə yetirmək haqqında əmr, sərəncam yazılmış kağız; əmrnamə. *Nazirlikdən əmr alındı. Əmrə tabe olmaq. Əmri yerinə yetirmək. – Vahidin məktəbdən kənar edilməsi haqqındakı əmri oxuyanda Muxtar təəccüb elədi.* Mir Cəlal. ◻ **Əmr vermək** – əmrnamə, sərəncam yazmaq, nəşr etmək, elan etmək. *Təyinat haqqında əmr vermək.*

2. Hökumət orqanının, idarə, müəssisə, təşkilat və s. rəhbərlərinin rəsmi sərəncamı. *Hərbi komissarlığın əmri. İnstitut direktorunun əmri.* – [Komandir:] *Göz-qulaq ol! – əmrini verdikdən sonra ordugaha döndü.* H.Nəzərli. *Tapşırıq görüldü yoldaş komissar! Mən yenə hazıram, nə əmriniz var?* S.Vurğun. *Dəstə öz komandirinin əmri ilə irəliləyirdi.* Ə.Vəliyev.

◊ **Əmr siğəsi** – "əmr forması"nın köhnə qrammatikada adı. **Əmr forması** *qram.* – zaman və xüsusi əlaməti olmayan, yalnız şəxs şəkilçiləri qəbul edən feil qrupu. **Əmr cümləsi** *qram.* – əmr ifadə edən cümlə. **Əmrdən çıxmaq** – tabe olmamaq, göstərişə, əmrə əməl etməmək. **Əmri-qaib** – köhnə qrammatikada: üçüncü şəxsə edilən əmr. **Əmri-hazır** – köhnə qrammatikada: ikinci şəxsə edilən əmr. **Əmrinə vermək** – ixtiyarına vermək. *Komandanın əmrinə çoxlu sursat və qoşun verilmişdir.*

**ƏMR**[2] *is.* [*ər.*] İş. [Şah:] *Sizi bir əmrdən ötrü məsləhətə çağırmışam, gərək haman xüsusda bir tədbir göstərəsiniz.* M.F.Axundzadə. *Olmaz bu ki hər əmrə dəxalət edə fələ; Dövlətli olan yerdə cəsarət edə fələ.* M.Ə.Sabir. *Mən istəmirəm, Xudayar bəyin keçəcəyindən danışam, çünki özü də heç bu əmrə razı olmaz.* C.Məmmədquluzadə. ◻ **Əmri aşmamaq** – işi keçməmək, çətinlik çəkmək. **Əvvəl əmrdə** *köhn.* – ilk olaraq, birinci növbədə, əvvəlcə, əvvəl başdan.

**ƏMRAZ** *is.* [*ər.* "mərəz" söz. cəmi] *köhn.* Azarlar, xəstəliklər. *Sirayətli əmraz. – Mən çəkirəm onun işvəylə nazın; Gör canda artırdı necə əmrazın.* Aşıq Maqsud.

**ƏMRİ-VAQE** *is.* Olmuş, olub bitmiş iş. *Əmri-vaqe qarşısında qalmaq. Əmri-vaqe qarşısında qoymaq. – Zeynal heç inanmayırdı ki, Mehriban öz çocuqlarından əl çəkə*

*bilər, fəqət bu, bir əmri-vaqe idi.* S.Hüseyn. [Əli:] *Din bir əmri-vaqe olaraq, insaniyyətlə bərabər doğulmuş və əsrlərdən bəri dolanbac tarix yollarında onu təşyi edir.* Çəmənzəminli.

**ƏMRNAMƏ** *is.* [*ər.* əmr və *fars.* ...namə] Əmr yazılmış kağız, yazılı əmr. *Əmrnaməyə görə. Əmrnamə ilə tanış olmaq.* – // Əmr. *Əmrnamə dəftəri. – Əmrnamə yazılmış və Balacayev tərəfindən imzalanmışdı.* S.Rəhimov.

**ƏMSAL** *is.* [*ər.* "misal" söz. cəmi] 1. *klas.* Oxşar(lar), bənzər kimi(lər). *Şiəyəm, əmma nə bu əşkaldən; Sünniyəm, əmma nə bu əmsaldən.* M.Ə.Sabir.

2. Misl, tay-bərabər. *Əmsalı görünməmiş* (misli görünməmiş).

3. *riyaz.* Cəbri ifadədə ədədi (ya hərfi) cəmlənmə. // Axtarılan ədədi əldə etmək üçün müəyyən kəmiyyətə vurulmalı olan ədəd. // Fiziki cismin hər hansı bir xüsusiyyətini təyin edən kəmiyyət.

**ƏMTƏƏ** *is.* [*ər.* "məta" söz. cəmi] *iqt. kit.* Mübadilə üçün istehsal edilən əmək məhsulları; mal. *Əmtəə insanın hər hansı bir ehtiyacını təmin edən, habelə başqa şeyə dəyişdirilən şeydir.* – [Ömər Lütfi:] *Şəhərdə olan bütün əmtəə təcili surətdə ixrac edilməlidir.* H.Nəzərli. □ **Əmtəə dövriyyəsi** *iqt.* – malların xalq təsərrüfatında dövr etməsi. *Şəhərlə kənd arasında əmtəə dövriyyəsinin artması.* **Əmtəə istehsalı** *iqt.* – səciyyəvi xüsusiyyəti, alğı-satqı yolu ilə mübadilə üçün məhsul istehsal etməkdən ibarət olan ictimai istehsal. **Əmtəə mübadiləsi** *iqt.* – mal mübadiləsi, mal dəyişmə. *Beynəlxalq əmtəə mübadiləsi.*

**ƏMTƏƏLİK** *sif. iqt.* Əmtəə kimi satılacaq; satlıq, bazarlıq. *Əmtəəlik heyvan.*

**ƏMTƏƏŞÜNAS** *is.* [*ər.* əmtəə və *fars.* ...şünas] Əmtəəşünaslıq mütəxəssisi. *Əmtəəşünas vəzifəsi.*

**ƏMTƏƏŞÜNASLIQ** *is.* Malların növlərindən, keyfiyyətlərindən, istehlak dəyərindən bəhs edən elmlərin məcmusu.

**ƏMUD** [*ər.*] 1. *riyaz.* Şaquli olaraq yuxarıdan aşağıya enən və düzbucaq əmələ gətirən xətt; şaquli xətt.

2. Polad toppuz. *Qılıncdan murad hasil olmadı, əmuda əl atdılar.* "Koroğlu". *Rüstəm Zal dastanları, Hüseyn Kürd əmudları, ovçu Pirim sərgüzəştləri, Bəhram Gurun ov səyahətləri ayrı-ayrı lövhələrdə təsvir edilmişdi.* S.Rəhimov.

**ƏMUDİ** *sif.* [*ər.*] Şaquli. *Əmudi xətt.*

**ƏMVAL** *is.* [*ər.* "mal" söz. cəmi] *köhn.* Mallar. *Biz məgər aclara vəqf eyləmişik malımızı? Ta ki hər müstəhəqə bəzl edək əmvalımızı.* M.Ə.Sabir. *Onda məxluqat nəinki bu fani dünyanın əmvalından, hətta öz əyalından və canından belə keçər.* S.Rəhimov.

**ƏMZİK** *is.* 1. Sormaq üçün körpə uşağın ağzına verilən içiboş rezin borucuq. *Uşağa əmzik ver, ağlamasın.* – [Xarrat:] *Uşaqlar əmziklə bəslənirdilər..* T.Ş.Simurq. *Qaragöz körpələri sakit edib əmzik vermiş, nənniyə salmışdı.* M.İbrahimov.

2. İçində süd, çay və s. olan şüşənin ağzına keçirilən deşikli rezin borucuq. *Əmziyin südünü boşaltmaq.*

**ƏMZİKLƏMƏK** *f. məh.* Döş kimi sallanmaq.

**ƏMZİKLİ** *sif.* 1. Südəmər uşağı olan. *Əmzikli qadın.*

2. Əmzik keçirilmiş, əmziyi olan. *İnək və camışları, xüsusən ilkinə doğan düyələri mütləq balasız sağmağa, balası isə əmzikli qabdan süd içməyə öyrətməlidir.* "Qaramal".

3. Mayeni tökmək üçün ağzında yarıq şəklində yeri olan. *Əmzikli şüşə.*

**ƏN** *ədat.* Keyfiyyət bildirən sifətlərin və zərflərin əvvəlinə gətirilərək üstünlük, şiddət bildirir. *Ən böyük çay. Ən iti uçan təyyarə. Ən sağlam adam. Ən qısa. Ən uzun. Ən gözəl. Ən axırda. Ən əvvəldə. Ən sonra* (lap axırda). *Əlin ən uzun barmağı orta barmaqdır. – Mədən işlərinə olan böyük həvəsi sayəsində* [Araz] *artıq ən təcrübəli bir usta olmuşdu.* A.Şaiq. *Aralarında ən yaşlıları olan Rəşid atı saxladı.* H.Nəzərli. *İnsan orqanizminin ən həssas və işlək üzvü olan ürək azad döyünməyi çox sevir.* Ə.Vəliyev.

**ƏNAM** *is.* [*ər.* "nemət" söz. cəmi] Bəxşiş, hədiyyə, mükafat. *Ənam almaq. Ənam vermək.* – [Odabaşı:] *Hətta Mirzə Əhməd ağa qız üçün ənam göndərmişdi.* Ə.Haqverdiyev. [Rəhim xan:] *Əgər Nəsrəddin şahın ənamı olmasaydı, bu saat səni həlak edərdim.* C.Cabbarlı. □ **Ənam eləmək** *klas.* –

bağışlamaq, vermək. *Haq mənim ömrümü kəssin, sənə ənam eləsin.* S.Ə.Şirvani.

**ƏNBƏR** *is.* [*ər.*] 1. Kaşalota oxşar bir balığın mədəsindən çıxarılan gözəl qoxulu maddə. *Ənbər qara, boz, sarı rəngli, çox yağlı maddədir.*

2. Xoş qoxu, ətir. *Ənbər qoxumaq.* // Sif. mənasında. *Mən qurbanı olum ənbər tellərin; Qönçə dodaqların, püstə dillərin.* Nəbati.

3. *məc. klas.* Gözəlin saçına, zülfünə işarə. *Ləblərin görən neylər; Görə bir də ənbəri.* (Bayatı).

**ƏNBƏRBAR** *sif.* [*ər.* ənbər və *fars.* ...bar] *klas. şair.* Ənbər saçan, ətir saçan. *Ənbərbar zülf. – Görməmişəm belə bir səfalı zülf; Çox sünbüli-ənbərbarı tutmuşam.* M.P.Vaqif.

**ƏNBƏRBU** *sif.* [*ər.* ənbər və *fars.* bu] 1. *klas. şair.* Ənbər qoxulu, ənbər kimi ətirli.

2. Ağ, parlaq, ipi dənəli əla düyü növü. *Ağ ənbərbu. Ənbərbu düyü.*

**ƏNBƏRÇƏ** *is. köhn.* Qızıldan döş bəzəyi. *Keçmişdə bir çox kəndlərdə qadınlar döşlərinə ənbərçə taxırdılar.*

**ƏNBƏRFƏŞAN** *sif.* [*ər.* ənbər və *fars.* ...fəşan] *klas. şair.* Ənbər saçan, ətir səpələyən; ənbər qoxuyan. *Badi-səba İsa kibi gərçi dirildir ölüyü; Ənbərfəşan zülfün dəmi badi-səbayə tən edər.* Ə.Nəbati.

**ƏNBƏRƏ** *is.* Dəyirman çarxını işlədən suyun yığılıb şiddətlə töküldüyü nov. *Dəyirmanın suyu ənbərəyə yığılır, oradan tökülür və çarxı işlədir.*

**ƏNBƏRİ** *sif.* [*ər.*] Ənbər kimi, ətirli, xoşiyli.

**ƏNBƏRİN** *sif.* [*ər.* ənbər və *fars.* ...in] *klas. şair.* Ənbər kimi ətirli, ətir saçan. *Cənnətin ənbərin qapıları usta Ağabalanın üzünə açıldı.* Çəmənzəminli.

**ƏNBİR** *is.* Dəmirçi tutğacı, maşası. *Dəmirçilər qızğın dəmiri ənbirlə tutub döyürlər.*

**ƏNBİYA** *is.* [*ər.* "nəbi" söz. cəmi] Nəbilər, peyğəmbərlər.

**ƏNCAM** *is.* [*fars.*] 1. Son, axır, nəhayət, nəticə. *Hər işi əncamı ilə ölçərlər. Əncamı xeyir olsun* (axırı xeyir olsun). □ **Əncam qılmaq (vermək)** – sona vardırmaq, nəticələndirmək. [Böyükxanım:] *Allah rizasına, bizi dil-dişə salma! İşlərə əncam verginən!* M.S.Ordubadi. **Əncam tapmaq** – sona varmaq, nəticələnmək. [Ağamərdan:] *Amma Zeynəb xanım gərək mənim hər sözümə, hər tədbirimə əməl etsin ki, bu iş əncam tapa.* M.F.Axundzadə.

2. Kömək, vasitə, yol, tədbir. □ **Əncam etmək (çəkmək)** – həllinə, başa gəlməsinə, qaydaya düşməsinə kömək etmək, çıxış yolu tapmaq, tədbir görmək. *İndi naxoşdu milləti-islam; Ona lazımdır eyləmək əncam.* S.Ə.Şirvani. [Aslan bəy:] *Sən ehtiyatlı ol, mən özüm bu işə əncam çəkərəm, – dedi.* A.Şaiq. [Hacı Murad:] *Məhərrəm bəy gəlsin, görək işə nə əncam çəkirik.* S.S.Axundov. **Əncama qoymaq (salmaq)** – yoluna qoymaq, yoluna salmaq, qaydaya salmaq. *Məktəb işlərini əncama saldınmı? – O, Tütünçüoğlu və Həsənağanın vasitəsilə hər bir işi əncamına salmışdı.* M.S.Ordubadi.

**ƏNCAMƏ** *is.* Qapı və pəncərə qanadlarını çərçivəyə bağlayan və onların açılıb-örtülməsinə imkan verən dəmir hissə; rəzə. *Qapı əncaməsindən çıxmışdır.* □ **Dişi əncamə** – əncamənin qapı açılıb-örtüləndə onunla bərabər dönən hissəsi. **Erkək əncamə** – əncamənin qapı açılıb-örtüləndə çərçivədə hərəkətsiz duran hissəsi.

**ƏNCİR** *is.* [*fars.*] İçində xaş-xaş kimi xırda tumları olan ətli, şirin, yumşaq qabıqlı, yumru meyvə. *Əncir mürəbbəsi. Əncir doşabı. Əncir ağacı. Əncir qurusu* (qurudulmuş əncir). – [Molla] *gedib, var-yox pulunu verib bir səbət yaxşı əncir alır, aparır Teymura.* "M.N.lətif." *Bir-iki dəqiqədən sonra böyük bir əncir ağacının yanından, haman şəhərdən tanıdığım Əhmədin çıxdığını gördüm.* T.Ş.Simurq. // Həmin meyvənin ağacı. *Əncirin altında oturmaq.*

**ƏNCİRLİ** *sif.* 1. Əncir ağacları olan. *Mən səni çox görmüşəm cavanlıq çağlarında; Bol əncirli, üzümlü Novxanı bağlarında.* S.Rüstəm. *Kərim bəy burada, bu əncirli həyətdə nəvəsini məşğul edən bir şey olduğunu duydusa da, üz vurmadı.* Mir Cəlal.

2. Tərkibində, içində əncir olan. *Əncirli konfet.*

**ƏNCÜMƏN** *is.* [*fars.*] *kit. köhn.* Məclis, cəmiyyət, şura. *Səttar xan məsələni əncüməndə qoymaq üçün bir söz demədi.* M.S.Ordubadi. // Camaat. *Hər söz ki gəlir*

*zühurə məndən; Min tənə bulur hər əncüməndən.* Füzuli.

**ƏNDAM** *is.* [*fars.*] 1. Bədən. *Qaşı, gözü, əndamı, tamamən əl-ayağı; Hər bir sənəmin başına yüz naz kimindir?* M.V.Vidadi. *Uşağın əndamına quru xına sürtməyə başlardılar.* H.Sarabski.

2. Boy, qədd, qamət, boy-buxun, bədən quruluşu. *Əndamı olduqca düzgündür. – Bunların şirin ləhcələri, duzlu danışıqları, mütənasib əndamları və alıcı, xumar gözləri vardır.* M.S.Ordubadi. ☐ **Əndamın yansın (açılsın), əndamı yanmış (açılmış)** – qarğış ifadəsi. *Anası Gülpərinin təpəsinə iki əlli qapaz vurub deyərdi: – Əndamı açılmış, bir bax, gör uşağı nə günə salmısan!* H.Sarabski. **Əndamına lərzə düşmək** – titrəmək, əsmək (qorxudan).

**ƏNDAMLI** *sif.* 1. Boylu, boylu-buxunlu, biçimli, bədən quruluşu çox düzgün, gözəl bədənli.

2. Bir qədər dolğun, bədən quruluşu yerli-yerində. [Sultan bəy:] *Əsil mən deyən arvad elə o idi ki, hallıca, dul, əndamlı..* Ü.Hacıbəyov. *..Əndamlı xanım xalata oxşar, qırmızı güllü, sarı paltar geymişdi.* M.İbrahimov.

**ƏNDAMSIZ** *sif.* Bədən quruluşu yerli-yerində olmayan; biçimsiz. // Boysuz, qısaboylu.

**ƏNDAMSIZLIQ** *is.* Əndam çirkinliyi, bədən nöqsanı, bədən quruluşunun düzgün olmaması; biçimsizlik.

**ƏNDAZƏ** *is.* [*fars.*] 1. Kağızdan, kartondan kəsilmiş ülgü. // Ölçü, miqyas, ölçü vahidi. ☐ **Bir əndazədə** – bir ölçüdə, bir qaydada. [Qızların] *hamısının libası bir qiymətdə, bir əndazədə və bir ölçüdə idi.* M.S.Ordubadi.

2. Tənasüb, simmetriya, quruluş düzgünlüyü. *Onun bədən əndazəsi yerli-yerindədir.*

3. *məc.* Hədd, hüdud; norma. *Hər şeyin əndazəsi olmalıdır. Əndazədən artıq. – Əndazə qoyaq, üç gün oturaq.* (Ata. sözü). *Tükün əndazədən artıq görünür; Quyruğun gör necə yerlə sürünür.* A.Səhhət. ☐ **Əndazədən çıxmaq** – əndazəni aşmaq, həddini aşmaq. *Görsən tanımazsan yarımsaqqalı; Çıxıb əndazədən dövləti, malı.* Q.Zakir. [Sübhanverdizadə] *hər hansı bir qonaqlıqda əndazədən çıxmaz və öz hörmətini gözlərdi.* S.Rəhimov. **Əndazəyə düşmək** – lazımi şəklə düşmək. **Əndazəyə salmaq** – yöndəmə, qaydaya salmaq, lazımi şəklə salmaq.

**ƏNDAZƏLİ** *sif.* Biçimli, düzgün, mütənasib, qaydalı, hər cəhətdən yerli-yerində.

**ƏNDAZƏSİZ** *sif.* 1. Biçimsiz, ölçülməmiş, tənasübsüz, ölçüsüz. *İndi bizim evin quruluşu sənə olduqca ölçüsüz-biçimsiz və əndazəsiz görünür.* M.S.Ordubadi.

2. Hesabsız, saysız, çox qeyri-məhdud.

**ƏNDƏLİB** *is.* [*ər.*] *klas.* Bülbül. *Hər qanda eşitdi bir təbibi; Gülzarının oldu əndəlibi.* Füzuli. *Ey əndəlib, səndə bu nə qanundur; Fəğan çəkmək növbaharı görəndə.* Q.Zakir. *Əndəliblər yaz axtarar; Ovçu ördək, qaz axtarar...* Aşıq Şəmşir.

**ƏNDƏ-MƏNDƏ: əndə-məndə demək** *dan.* – yersiz danışmaq, artıq-əskik danışmaq. *Pulsuz rəncbər atar bir fitə ortası dəlik; Əndə-məndə desə, ombasına beş-on da təpik.* M.Möcüz.

**ƏNDƏR-DÖNDƏR: əndər-döndər eləmək** *dan.* – alt-üst etmək, yoxlamaq, axtarmaq, araşdırmaq. *Rövşən getdi, dağları, daşları əndər-döndər elədi.* "Koroğlu".

**ƏNDƏRİLMƏ** "Əndərilmək"dən *f.is.*

**ƏNDƏRİLMƏK** *f.* 1. Hamısı birdən-birə tökülmək. *Başına bir vedrə su əndərildi.*

2. Birdən yıxılmaq, aşmaq. *Ağacın üstündə olan uşaq birdən yerə əndərildi. – Atlı köklü ağac kimi əndərildi, lakin sol ayağı üzəngiyə ilişib qaldığından, at onu sürüyə-sürüyə apardı.* Çəmənzəminli.

**ƏNDƏRQƏLİB**: **əndərqəlib eləmək** *dan.* – başdan eləmək, rədd eləmək. *Necə, nə təhər eləyim? Get, at çölə, əndərqəlib elə çıxsın getsin.* M.İbrahimov.

**ƏNDƏRMƏ** "Əndərmək"dən *f.is.*

**ƏNDƏRMƏK** *f.* 1. Duru, yaxud səpələnən şeyləri qabdan və s.-dən birdən-birə və bütünlüklə tökmək, boşaltmaq. *Vedrənin suyunu əndərmək. Çuvalın ağzını açıb unu təknəyə əndərdi. – Lakin ansızın bir təsadüf Ağabəyimin düşüncə kasasını əndərdi, sakit və fərəhli həyatına zəhər qarışdırdı.* Çəmənzəminli.

2. Bax **endirmək**. *Ceyran çəkib qılıncı endirdi divə, div əl atıb, Ceyranın biləyindən tutub sıxmağa başladı.* (Nağıl).

**ƏNDƏRUN** [*fars.*] 1. *sif. köhn.* İç, içəri, daxil. *Pişxidmətbaşı və xacə Mübarək düşdülər qabağa, bir-bir əndərun otaqlarını göstərməyə şüru etdilər.* M.F.Axundzadə.

2. *is.* İran evlərində: evin ailə və qadınlara məxsus hissəsi. [Yusif şah:] [Xacə Mübarəkə:] *Çünki sən həmişə Şah Abbasın əndərununda olubsan, mümkün deyil ki, bu qəziyyə sənə məlum olmasın.* M.F.Axundzadə. *Məclislə əndərunun arasında dolaşan Fərman idi.* Ə.Haqverdiyev.

3. *is.* Ümumiyyətlə, otaq mənasında. *Mirzə öz əndərununa getdi, mən də soyunub yatdım.* Ə.Haqverdiyev.

**ƏNDƏRUNİ** b a x **əndərun** 1-ci mənada. *Şərq şəhərlərinə məxsus əndəruni və biruni, iki həyətli, bağçası evlərinə yanaşı, boz palçıqdan tikilmiş yoxsul və zəhmətkeş əhali yaşayan daxmacıqlar da çoxdur.* M.İbrahimov.

**ƏNDƏRZ** *is.* [*fars.*] *köhn.* Nəsihət, vəsiyyət.

**ƏNDİŞƏ** *is.* [*fars.*] 1. Fikir, qayğı. *Mənəm qalan haman bu əndişədə; Zəmanə dönübdür, qovğayə bir bax.* Q.Zakir. *Aldılar cümlə əllərə tişə; Yox könüllərdə özgə əndişə.* M.Ə.Sabir. *İnsanın əndişəsi çoxaldıqca onun yuxu görməyi də artır.* S.Rəhimov.

2. Narahatlıq, təlaş, nigarançılıq, təşviş, iztirab, qorxu. [Yusif:] *Musanın, o bədbəxt qardaşımın iztirab və əndişələri həp sönüb bitdiyinə bir aydın şahiddir.* H.Cavid. *Firidun bir zaman parlaq ay işığında Gülnazgilin yatdığı səkiyə çıxdı, əndişə ilə dolu o gecəni xatırladı.* M.İbrahimov. ☐ **Əndişə etmək, əndişəyə düşmək, əndişə çəkmək** – narahat olmaq, nigaran qalmaq, təşvişə düşmək, iztirab çəkmək, qorxmaq. *Doyunca zövq alaq nazü qəmzədən; Əndişə çəkməyək heç bir kimsədən.* M.P.Vaqif. [Yusif şah:] *Deyərsən ki, mənim cəhətimdən əndişə etməsin, sabah oğlanlarını hüzura göndərsin.* M.F.Axundzadə. **Əndişə oyandırmaq** – narahatlığa, təşvişə səbəb olmaq, qorxu, ehtiyat doğurmaq. // Şübhə, vəsvəsə, təlaş.

**ƏNDİŞƏLİ** *sif.* Əndişəsi, ürəyində fikri olan; dərdli, qayğılı, iztirablı. *Əndişəli adam. – Sonra qızın gözləri ovçunun əndişəli və sualedici baxışlarına sataşarkən, o, dilə gəldi.* Ə.Məmmədxanlı.

**ƏNDİŞƏLİLİK** *is.* Əndişəli, dərdli, fikirli, qayğılı, mənəvi iztirab çəkən, təşviş içində olan adamın hal və vəziyyəti.

**ƏNDİŞƏSİZ** *sif.* Əndişəsi, fikri, qayğısı, qorxulacaq bir şeyi olmayan; fikirsiz, qayğısız, dərdsiz, sakit, rahat. *Əndişəsiz adam.*

**ƏNDİŞƏSİZLİK** *is.* Fikirsizlik, qayğısızlıq, dərdsizlik.

**ƏNDUH** *is.* [*fars.*] *köhn.* Qəm, qüssə, kədər.

**ƏNƏK** *is.* 1. Yük atı, qoşqu atı, minik atı.

2. Heyvanın qulağına vurulan nişan. *Çoban ənəklərindən qoyunlarını tanıyır.*

3. B a x **ənk.**

**ƏNƏNƏ** *is.* [*ər.*] Tarixən meydana gələrək nəsildən-nəslə keçən adətlər, əxlaq normaları, görüşlər, zövqlər və s. *Pis ənənələri ortadan qaldırmaq. Azərbaycan xalqının gözəl ənənələri var. Teatrımızın özünə məxsus ənənələri vardır.* // Cəmiyyətdə, həyatda, məişətdə və s.-də müəyyənləşib sabitləşmiş qayda, üsul, norma, dəb. *Ənənə halını almaq.* – [Nüşabə:] *Bilər öz həddini, artıq anlar; Hər elin ənənəsi, mənliyi var.* A.Şaiq. *Ənənə uzun müddət ərzində bir neçə nəslin bədii dühası, coşqun yaradıcı əməyi nəticəsində yaranır.*

**ƏNƏNƏÇİ** b a x **ənənəpərəst.**

**ƏNƏNƏÇİLİK** b a x **ənənəpərəstlik**.

**ƏNƏNƏPƏRƏST** *sif.* [*ər.* ənənə və *fars.* ...pərəst] Adətən vaxtı keçmiş ənənələrə sadiq olan, ənənə saxlayan, ənənələrə riayət edən; mühafizəkar. *Ənənəpərəst adam.* – [Xosrov:] *İran xalqı olduqca mütəassib, ənənəpərəst, mövhumatpərəst bir xalqdır.* A.Şaiq.

**ƏNƏNƏPƏRƏSTLİK** *is.* Adətən vaxtı keçmiş ənənələrə sədaqət, ənənələrə riayət etmə; mühafizəkarlıq.

**ƏNƏNƏVİ** *sif.* [*ər.*] Ənənə şəkli almış, ənənə mahiyyətində olan. *Ənənəvi adət. Ənənəvi şeir.* // Ənənə üzrə keçirilən, keçən. *Ənənəvi görüş. Ənənəvi yarış. Ənənəvi müsamirə. Ənənəvi qonaqlıq.* // Ənənəyə əsaslanan, ənənə üzrə gələn; ata-babadan, nəslən. *Ənənəvi paltar. – Əlbəttə, bu ənənəvi bir matros ailəsi üçün son dərəcə böyük bir dərddi.* Ə.Əbülhəsən.

**ƏNƏNƏVİLİK** *is.* Ənənə mahiyyətində olma, ənənə kimi nəsildən-nəslə keçmə. *Adətlərin ənənəviliyi.*

**ƏNFİYƏ** *is.* [*ər.*] Burunotu.

**ƏNFİYƏDAN** *is.* [*ər.* ənfiyə və *fars.* ...dan] *köhn.* Burunotu qabı. *Qızıl Arslan ənfiyədanı götürüb baxdığı zaman rəngi ağardı, çünki ənfiyədan onun qardaşı Atabəy Məhəmmədin ənfiyədanı idi.* M.S.Ordubadi.

**ƏNFÜSİ** *sif.* [*ər.*] *köhn. kit.* Şəxsən düşünənə, onun düşüncəsinə, nəfsinə aid olan; subyektiv.

**ƏNG** *is.* Alt çənə. *Əng sümükləri. – Nə qoyarsanənginə; Rəngi çıxar rənginə.* (Ata. sözü). [Usta Həsən:] *Ay Hacı, dəllək nədir? Çağıracaqsan, gəlib bir at kəlbətinini salacaq dişinə, dartıb əngini də dişinin üstündə çəkəcək.* Ə.Haqverdiyev. *Kazım isə qoz ləpəsini o əngindən o biriənginə aparıb, onu əzməyə çalışırdı.* Çəmənzəminli.

◊ **Əngi qızışmaq** – çox danışmaq, uzunçuluq eləmək, çərənləmək. **Əngine vermək, əngini yormaq** – b a x **əngi qızışmaq**. *Boşla, xala, cəfəngini; Müftəcə yorma əngini.* Ə.Nəzmi.

**ƏNGALTI** *is.* Əngin alt tərəfi.

**ƏNGƏBƏNGƏ** *is. dan.* Bütün keçmiş və indiki nəsil. *Mən onun əngəbəngəsini tanıyıram.*

**ƏNGƏBU** *is.* [*fars.*] Bal qoxuyan bir ot bitkisi. *Əngəbu ilə arı beçələrini səbətə yığmaq olur.*

**ƏNGƏC** *is.* Su hövzəsindən suyu axıtmaq üçün nov, boru.

**ƏNGƏDUŞ** *is. köhn.* Ucu toppuzlu uzun dəmir. *Dəmirçilər əngəduşla kürəni qarışdırırlar.*

**ƏNGƏL** *is.* 1. Bir şeyin başa yetməməsinə, ya təxirinə səbəb olan şey; maneə, çətinlik. [İblis:] *Get, get, daha durma, artar əngəl.* H.Cavid. *Bu qüvvənin qarşısında heç bir əngəl dayana bilməz.* S.Rəhman. □ **Əngəl çıxarmaq (törətmək)** – çətinlik törətmək, ləngitmək, mane olmaq. *Məmləkət işinə əngəl törətmək üçün düşünən başları vurmaq lazımdır.* M.S.Ordubadi. **Əngəl çıxmaq** – 1) maneə törəmək; 2) cəncəl çıxmaq. [Leyla:] *Qorxuram, axırda çıxa bir əngəl; Deyəsən, başını girləyib əcəl.* S.Rüstəm. **Əngəl olmaq** – bir şeyin başa yetməsinə, həyata keçməsinə mane olmaq, başa çatmağa, həyata keçməyə qoymamaq, çətinlik törətmək. **Əngələ düşmək** – çətin vəziyyətə düşmək; pis, xoşagəlməz bir işə dolaşmaq. *..Çünki özümüzün əngələ düşməməyimiz üçün amerikalı qızı müdafiə etmək qərarına gəlmişdim.* M.S.Ordubadi. **Əngələ salmaq** – çətin vəziyyətə salmaq, pis, xoşagəlməz bir işə dolaşdırmaq. **Başına əngəl açmaq** – çətin vəziyyətə salmaq, cəncəl açmaq. [Əsgər:] *Biçarə Gülçöhrənin başına əngəllər açdım.* Ü.Hacıbəyov. [Səlim bəy:] *Ah, Mahmud bəy, qoyma, qoyma qaçsınlar; Qaçıb başımıza əngəl açsınlar.* S.Rüstəm.

2. *dan.* Azar, xəstəlik, yaxud nöqsan, çatışmazlıq mənasında. *Malda əngəl var. – Xanım, sizdən təvəqqe eləyirəm, oğlunuzun sözünə çox da qulaq asmayasınız, çünki onun əqlində bir az əngəl var.* N.Vəzirov.

**ƏNGƏLLƏMƏK** *f.* 1. Əngəl törətmək, çətinlik törətmək, əngəl olmaq.

2. *dan.* Azarlı olmaq, zəifləmək, səhhəti korlanmaq. *Canı əngəlləyibdir.*

**ƏNGƏLLİ** *sif.* Əngəli olan, çətin, dolaşıq, cəncəl, xatalı. *Əngəlli məsələ. Bir əngəlli iş vardı.* – [Müsafir:] *Heç zərər yox, burax asılsınlar; Daha əngəlli bir xəbər var, əvət!* H.Cavid. *Mahrunun mənə qarşı nə kimi vəziyyət alacağı, doğrudan da, bir az əngəlli və maraqlı məsələ idi.* M.S.Ordubadi.

**ƏNGƏLSİZ** *sif.* Əngəli olmayan, maneəsiz, asan başa gələn, çətinliklə bağlı olmayan, xatasız. *Əngəlsiz iş.*

**ƏNGƏL-ÜZAR** *sif. məh.* Çox çətin düzələn, böyük çətinliklərlə, əngəllərlə bağlı olan. *Əngəl-üzar iş.*

**ƏNGƏNƏK** *is. məh.* Saxsı ləyən, laxan, paltar yumaq üçün təknə; tabaq. *Həyətin bir səmtində var idi əngənək, yanında çoxluca yuyulmuş paltar qalanmışdı.* C.Məmmədquluzadə.

**ƏNGİBOŞ** *sif.* və *is. dan.* Çoxdanışan, boşboğaz, çənədən boş, naqqal.

**ƏNGİN** *sif. şair.* 1. Geniş, vüsətli, açıq, ucu-bucağı olmayan. *Əngin səma. Əngin üfüqlər. – Bizimdir bu əngin, atlaz ovalar; Qoynunda qartal bəsləyən qayalar.* A.Şaiq. *Mənimsə qəlbimə doğur bir səhər; Açılır qarşımda əngin üfüqlər.* S.Vurğun. *..Bu səadət səhəri o qədər əngin və işıqlıdır ki, başlanan günəşli gündüzün əbədiliyinə şübhə etmirsən.* Mir Cəlal.

2. B a x **ənginlik**. *Xəyalımın qanadında ənginlərə yol açdım; Gəzdim döyüş meydanını, səhraları dolaşdım.* R.Rza. *Dalıram, daldıqca boş ənginlərə; Rənglərə boyanan xoş ənginlərə.* N.Rəfibəyli.

**ƏNGİNLİK** *is. şair.* Genişlik, vüsət, açıqlıq; dənizin sahildən uzaq nöqtələri. *Yadımdadır, mən uzun zaman daş bənd üzərində oturub qaldım, heyran-heyran dənizin qaranlıqda itən ənginliklərinə baxdım.* Ə.Məmmədxanlı. *Midhət göylərə baxdı. Ovçu gözləri göyün ənginliklərini seçir, sirli və dərin havanın içinə girə bilirdi.* Ə.Vəliyev.

**ƏNHAR** *is.* [*ər.* "nəhr" söz. cəmi] *şair.* Çaylar.

**ƏNİK** *sif.* Yırtıcı, sərt heyvan balası. *Həyətlərində ənik bir it var.*

**ƏNİN** *is.* [*ər.*] *şair.* İnləmə, inilti, zarıltı. *Pianinodan həzin bir ənin qalxıb, bağçanın sükutu içində titrəyərək söndü.* İ.Əfəndiyev. *Ceyran baxışlı dilbər, durna gözlü nazənin; Ömründə görməmişdir nə göz yaşı, nə ənin.* N.Rəfibəyli.

**ƏNİS** *is.* [*ər.*] *şair.* Yaxın dost, ürək dostu, həmdəm. *Olsam qəmi-aləmə giriftar; Ancaq sən idin ənisü qəmxar.* Füzuli. [Xumar:] *Durma, yüksəl, ənisi-ruhim, gəl! Mütərəddid görünmə! Gəl, yüksəl!* H.Cavid. *Hələ bomboş otaqların qalın divarları arasında anasının yeganə ənis və munisidir.* A.Şaiq.

**ƏNKƏBUT** *is.* [*ər.*] *klas.* Hörümçək. *Cida düşüb ulusundan, elindən; Ənkəbut tək can asılır telindən..* Aşıq Ələsgər.

**ƏNQA** *is.* [*ər.*] *klas.* 1. Əsatirə görə Qaf (Elbrus) dağında yaşamış əfsanəvi çox iri bir quş; simurq.

2. Adı olub özü olmayan şey haqqında.

**ƏNQAZ** *is.* [*ər.*] *klas.* Uçulmuş binanın, ümumiyyətlə, dağılmış, sökülmüş, yıxılmış bir şeyin qalıqları, töküntüləri. *Kor gözün, şil əllərin bir qövmü məhv etməkdədir; Bax, onun ənqazidir bu ahü əfğan, bir utan!* H.Cavid.

**ƏNQƏRİB** *zərf* [*ər.*] *klas.* Tezliklə, lap yaxında, yaxın zamanda. *Qəm çəkmə ki, mən olunca qəmxar; Yarın sənə ənqərib olur yar.* Füzuli.

**ƏNLİK** *is.* 1. Qadınların yanaqlarına sürtdükləri toz və ya yağ halında olan kosmetik maddə – al boya. *Ənlik vurmaq. Ənlik sürtmək. – Fatı geyindi. Aynanı götürüb üzünə baxdı. Yanaqlarına ənlik sürtüb qızartdı.* Ə.Abasov.

2. Kökü tünd-qırmızı bir bitki. *Ənlik otundan qırmızı boya hasil edirlər.*

**ƏNLİK-KİRŞAN** *is.* Qadınların üzlərinə sürtdükləri ənlik və kirşandan ibarət kosmetik maddələr. *Sənin kimi mah-camal; Ənlik-kirşanı neylər?* (Bayatı).

**ƏNLİKLİ** *sif.* Üzünə ənlik vurmuş.

**ƏNLİKLİ-KİRŞANLI** *sif.* Üzünə ənlik və kirşan vurmuş. *Yaşı qırx beşdən artıq, lakin yanaqları ənlikli-kirşanlı bir qadın içəri girdi.* M.İbrahimov.

**ƏNÖV** *is.* Dalağın ağrılı şişməsi. *Ənöv basmaq. Ənöv tutmaq* (dalaq şişmə azarına tutulmaq). *İsitmədən dalağı şişib, ənöv olub.*

**ƏNTƏR** *is.* 1. Bədəninə nisbətən çox uzun qolları olan meymun. *Gözünün üstündə buxara papaq; Əntərə bənzəyir o kor yapalaq.* S.Vurğun.

2. *məc.* Çox çirkin, eybəcər, kifir adam haqqında.

**ƏNTİQ** *sif.* [*ər.* "ətiq"dən; ətiq – qədim] Qiymətli, dəyərli, nadir tapılan, çox gözəl, görünməmiş, hamının marağına səbəb olan. *Orada Hüseynqulu ağanın babasından qalma əntiq şeyləri saxlanırdı.* S.S.Axundov. [Aslanov] *istəsəydi, otaqların hər tərəfini əntiq şeylərlə bəzəyib, yaraşığa sala bilərdi.* M.Hüseyn.

**ƏNTİQƏ** 1. B a x **əntiq.** [Fizzə:] *Çox sağ ol, çox gözəl, çox əntiqə hədiyyələr gətiribsən mənə.* Ə.Məmmədxanlı. *Səhər Bağdad bazarını gəzib bu xanım üçün əntiqə bir hədiyyə almaq lazım idi.* M.S.Ordubadi. // Çox gözəl, çox qəşəng. *Əntiqə bir qız. – Toppuşun .. başı üçün, lap əntiqə bir yumru oğlan oldun! – deyə dəllək onun döşündən açdığı ağı küncə tullayıb, başqa döşlük götürdü.* S.Rəhimov.

2. Qəribə, əcibə. *Əntiqə adamsan. Əntiqə şeydir.*

**ƏNTİQƏBAZ** [*ər.* əntiqə və *fars.* ...baz] b a x **əntiqəçi**.

**ƏNTİQƏBAZLIQ** b a x **əntiqəçilik**. *Onun əntiqəbazlığına bələd olan səhiyyə şöbəsinin işçiləri göz qabağında şey qoymağa qorxurlar* . "Kirpi".

**ƏNTİQƏÇİ** *is.* Əntiqə şeylərlə maraqlanan, onları yığıb saxlayan adam.

**ƏNTİQƏÇİLİK** *is.* Əntiqə şeylərlə maraqlanma, onları yığıb saxlama.

**ƏNTİQƏFÜRUŞ** *is.* [*ər.* əntiqə və *fars.* ...füruş] Əntiqə şeylər alverçisi, əntiqə şeylər alıb-satmaqla məşğul olan adam.

**ƏNTİQƏFÜRUŞLUQ** *is.* Əntiqə şeylər alveri, əntiqə şeylər alıb-satmaqla məşğul olma.

◊ **Əntiqəfüruşluq eləmək** – özünü yeni-yeni və maraqlı xəbərlər bilicisi kimi göstərmək. [Sirat:] *Bəri gəl, bəydadaş, əntiqəfüruşluq eləmə!* Ə.Əbülhəsən.

**ƏNVA** *is.* [*ər.* "növ" söz. cəmi] Cürbəcür, növbənöv. *Ənva və əqsam quşlar ağacların bir budağından o biri budağına qalxıb, qonub mövzun nəğəmat ilə dərəyə qülğülə salırlar.* M.F.Axundzadə. *Nökər Səfi stolun üstünə boşqablar və ənva məşrubat düzür.* Ə.Haqverdiyev. □ **Ənvai-müsibətlə** – çox çətinliklə, çox böyük əziyyətlə. *Min ənvai-müsibətlə qayaya dırmaşdı.* "Koroğlu". *Kişi ənvai-müsibətlə qapının qıfılını sındırar və açardı.* H.Sarabski.

**ƏNVAR** *is.* [*ər.*] *köhn.* İşıqlar.

**ƏNVƏR** *sif.* [*ər.*] *klas.* Çox nurlu, çox işıqlı, çox parlaq. *Tənha yürür oldu ol səmənbər; Zülmətdə misali-mahi ənvər.* Füzuli.

**ƏNZAR** *is.* [*ər.* "nəzər" söz. cəmi] *klas. tənt.* Nəzərlər, baxışlar. *Açma gözün, baxma bir öz halına; Cəlb elə ənzarı yoğun şalına.* Ə.Qəmküsar.

**ƏNZƏLİ** *is.* [İranda şəhər adından] Azərbaycan xalq oyun havalarından birinin adı. *Tərəkəmə oyun havası ilə ənzəli oyun havasını müqayisə etsək, burada hər iki havanın vəzninin eyni və çalınmaq sürətinin də təxminən bərabər olduğunu görərik.* Ə.Bədəlbəyli.

**ƏPPƏK** *is.* ["**ətmək**"dən.] Çörək. *Ət yeməz, suyuna əppək doğrar.* (Məsəl). [Qurbanəli:] *Bir əppəkdən-zaddan ver, zəqqumlanaq.* N.Nərimanov.

◊ **Əppək olub göyə uçmaq** – yox olmaq, qeyb olmaq, yoxa çıxmaq. *Məlikməmmədin düz on dörd yaşı tamam olan gecə o otaqda ki yatmışdı, elə o otaqda bir əppək oldu, uçdu göyə.* (Nağıl).

**ƏPPƏKLİ** *is.* Qabıqlarında aşı maddəsi olan, meşə rayonlarında və orta dağ qurşaqlarında bitən ağac.

**ƏPRİMƏ** "Əprimək"dən *f.is.*

**ƏPRİMƏK** *f.* 1. Çürüyüb tökülmək, çürüyüb didilmək, didik-didik olmaq. *Çadırın yanları əprimişdir.*

2. *məc.* Əldən düşmək, tökülmək, üzülmək.

**ƏPRİMİŞ** *f.sif.* 1. Çürüyüb tökülmüş, çürüyüb didilmiş, didik-didik olmuş. *Bəndalı taxt üstündə, tüfəng yanında, Məsmə də oğlu ilə yanaşı, yerdə əprimiş, yamaqlı bir palaz üstündə uzanıb yatmışdılar.* Mir Cəlal.

2. *məc.* Əldən düşmüş, tökülmüş, üzgün.

**ƏR** 1. *is.* Arvadın qanuni və məhrəm yoldaşı olan kişi; zövc. *Dedi kim, bu məzarıdır ərimin; Ol üzü gül, boyu sənubərimin.* S.Ə.Şirvani. *Zeynəb .. ərinə deyirdi: – Bilmirəm, mən olmasaydım, sən .. necə yaşıya bilərdin?* S.S.Axundov. *Arvad qab dəsmalı ilə yaşarmış gözlərini silib ərinin qabağında döyükə-döyükə qaldı.* S.Rəhman. □ **Ərə getmək** – nikahlanmaq, birinin arvadı olmaq. [Nənəcan] *bir qarından ötrü ərə getməkdən dul yaşamağı əfzəl bilirdi.* N.Nərimanov. [Pəri:] *Fəqət ərə getmək asanmı?* C.Cabbarlı. [Gülnaz:] *Yox, yox, mən səndən başqa özgəsinə ərə getməyəcəyəm.* Ü.Hacıbəyov. **Ərə vermək** – nikahlatmaq, öz qızının, bacısının və s.-nin biri ilə nikahlanmasına razı olmaq. [Sərvər:] *..Atan səni bir özgəsinə ərə vermək istəyir.* Ü.Hacıbəyov.

2. *sif.* və *is.* Sözündə möhkəm, mərd; qəhrəman, igid, qoçaq. *Yaxşılığa yaxşılıq hər kişinin işidir; Yamanlığa yaxşılıq ər kişinin işidir.* (Ata. sözü). [Orxan:] *Ər kişidə olur bir söz, bir məram.* H.Cavid. [Altunbay:] *Səndə doğrudan da bir ər ürəyi varsa, açıq söylə; Solmazı çoxmu sevirsən?* C.Cabbarlı.

◊ **Ər oğlu ər** – igid, qəhrəman. [Nəbi:] *Bizimkilərdir; Qəhrəmanla Vəli ər oğlu ərdir.* S.Rüstəm.

**ƏRAF** *is.* [*ər.*] Dinə görə cənnətlə cəhənnəm arasında olan yer.

**ƏRAQ** *is.* [*xüs. is.*-dən] *mus.* 1. Azərbaycan klassik muğamlarından birinin adı. *12 əsas muğam bunlar idi: üşşaq, nəva, busəlik,*

*rast, Əraq, İsfahan, zirəfkənd, büzürg, zəngulə, rəhavi, Hüseyni və Hicaz.* Ü.Hacıbəyov.

2. B a x **araq.**

**ƏR-ARVAD** *is.* Kişi ilə arvadı bir yerdə. *Ər-arvad bizə qonaq gəlmişdilər. Ər-arvad çox yaxşı yaşayırlar. – Nəhayət, ər-arvad yorulur və daş kimi yıxılıb yatırlar.* S.Rüstəm. *Ər-arvad belə qərara gəlmişdilər ki, Həmzə gizlənməyib hərdən lap bazara da çıxsın, kəndlərə gedib tanış-bilişinə də baş çəksin..* Ə.Əbülhəsən. *Ər-arvad ha fikirləşdilər, qulluğa olan ümidlərini söndürə bilmədilər.* Mir Cəlal.

**ƏR-ARVADLI** *zərf* Ər və arvad bir yerdə olduqları halda. *Ər-arvadlı gəldilər.*

**ƏR-ARVADLIQ** *is.* Ərlə arvadın qohumluq münasibəti; izdivac.

**ƏRAZİ** *is.* [*ər.* "ərz[1]" söz. cəmi] Müəyyən hüdudları olan torpaq sahəsi. *Respublikamızın ərazisi. – Rey məmləkəti bir padşahın sahib ola biləcəyi ərazidən bir neçə qat artıqdır.* M.S.Ordubadi.

**ƏRBAB** *sif.* [*ər.* "rəbb" söz. cəmi] *köhn.* Ağa, cənab; sahib. [Əliqulu:] *Ancaq ərbabın bir balaca nəqahəti var.* S.S.Axundov. *Sevinc qapınızdan çox uzaq keçdi; Yalnız ərbabların günü ağ keçdi.* S.Rüstəm. *Ərbabın sükutu Ağarzaya bir qədər də cürət .. verdi.* Mir Cəlal. // *dan.* Bəzən zarafatla, masqara ilə deyilir.

**ƏRBƏİN** *is.* [*ər.*] Müsəlman təqvimində: məhərrəm ayının birindən başlayaraq qırx gün davam edən müddət. ◻ **Ərbəin günü** *din.* – Kərbəla hadisəsinin (Hüseynin qətlinin) qırxıncı günü.

**ƏRCANLI** *sif.* Ərini çox sevən və ona yaxşı qulluq edən (arvad).

**ƏRCİK** "Ər"dən *oxş.*

**ƏRDƏM** *is. dan.* Hövsələ, səbir, həvəs, girdar. *Ərdəmi yoxdur.* – [Molla dedi:] *..Pilləkənləri düşüb-çıxmağa ərdəmim gəlmir.* "M.N.lətif.". *Ərdəmin var, bu yollarda yüz tufana döz bir, qoçaq! Bu meydandan xəcil gedib mənəm deyən yüz bir qoçaq!* R.Rza. *Səndən hərəkət, məndən bərəkət. Təki səndə ərdəm olsun.* S.Rəhimov.

**ƏRDO[1]** *is. mif.* Qorxunc vücud; qulyabanı. *Qorxma oğlum! Ərdo yoxdur, yalandır; O ağaran su üzündə dumandır.* A.Səhhət. // *məh.* İribədənli, qorxunc, çirkin adam haqqında. *Ərdodu, qabandı, qoyma, gəldi!* M.Ə.Sabir.

**ƏRDO[2]** *is. dan.* 1. Paltar yuyulmuş çirkli su.

2. *məc.* Horra, yal. *Xörək deyil, ərdodur.*

**ƏRƏB** *is.* 1. Ön Asiyada və Şimali Afrikada yaşayan, sami dilləri qrupuna daxil olan xalq və bu xalqa mənsub adam. *Ərəb dili. Ərəb xalqı. Ərəb ölkələri. – Türk, hindu, ərəb, əcəm bilməz; Nuri hər yanda artar, əskilməz.* H.Cavid. *Haqq yolunda mübarizə şüarıyla çıxdın yola; Ərəb qızı, bu əzmində sənə min-min uğur ola!* N.Rəfibəyli.

2. *məc.* Qara adam, zənci mənasında. *Bu lap ərəbdir ki.*

◊ **Ərəb atı** – xüsusi cins, əla minik atı. *Səyirtdi düzlərdə ərəb atları; Ayaqlar altında insan başları.* S.Vurğun. **Ərəb rəqəmləri** – Rum rəqəmlərinə qarşı olaraq indi işlənməkdə olan rəqəmlər (1, 2, 3 və s.). *Ərəb rəqəmləri qədim vaxtlarda heç bir millət arasında mütədavil deyildi.* F.Ağazadə.

**ƏRƏBCƏ** 1. *sif.* və *zərf* Ərəb dilində. *Ərəbcə kitab. Ərəbcə danışmaq.* – [Murad] *bir qismi ərəbcə və farsca, bir qismi türkcə yazılan məzar daşlarının sahiblərinin vəfat tarixlərini oxuyurdu.* S.Hüseyn.

2. *is.* Ərəb dili. *Ərəbcəni yaxşı bilir. Ərəbcədən tərcümə.*

**ƏRƏBCƏLƏŞDİRİLMƏ** "Ərəbcələşdirilmək"dən *f.is.*

**ƏRƏBCƏLƏŞDİRİLMƏK** *məch.* Ərəb dili qaydalarına uyğunlaşdırılmaq.

**ƏRƏBCƏLƏŞDİRİLMİŞ** *f.sif.* Ərəb dili qaydalarına uyğunlaşdırılmış.

**ƏRƏBCƏLƏŞDİRMƏ** "Ərəbcələşdirmək"dən *f.is.*

**ƏRƏBCƏLƏŞDİRMƏK** *f.* Ərəb dilinin qaydalarına uyğunlaşdırmaq.

**ƏRƏBCƏLƏŞMƏ** "Ərəbcələşmək"dən *f.is.*

**ƏRƏBCƏLƏŞMƏK** *f.* Ərəb dilinə uyğunlaşmaq, öz şəklini ərəb dilinin təsiri ilə dəyişmək.

**ƏRƏBÇİLİK** *is. dilç.* Heç bir lüzum və ehtiyac olmadan Azərbaycan dilinə çoxlu ərəb söz və ifadələri gətirmə və bu yolda göstərilən fəaliyyət. *Dilimizin tarixində ərəbçilik tərəfdarları ilə ciddi mübarizə aparılmışdır.*

– *1905-ci il inqilabı dövründə nisbətən artmış olan burjua mətbuatının dil siyasətində biz iki meylə rast gəlirik*: *1) farsçılıq və ərəbçilik; 2) osmançılıq.* M.İbrahimov.

**ƏRƏBDOŞANI** *is.* İncə belli, quyruğu qotazlı, uzunsov bir heyvan.

**ƏRƏBİ** *sif.* [*ər.*] Ərəbcə; ərəb dilinə və xalqına mənsub; ərəb üslubunda, ərəb qaydasında. *Ərəbi bir uzun don əynində.* A.Səhhət. *İki nəfər 10-12 yaşında uşağı geyindirib başına ağ əmmamə, əyinlərinə də ərəbi köynək taxardılar.* H.Sarabski. [Əhməd:] *Qara saçları, eşqlə dolu uzun kirpikli gözləri, ərəbi burnu, hamısından artıq gözəl balaca ağzı, qırmızı dodaqları mənim xoşuma gəldi.* T.Ş.Simurq.

**ƏRƏBİST** *is.* 1. Bax **ərəbşünas**.

2. Ərəbçilik tərəfdarı.

**ƏRƏBİSTİKA** bax **ərəbşünaslıq**.

**ƏRƏBİZM** *is.* 1. Bax **ərəbçilik**.

2. *dilç.* Azərbaycan dilinə girmiş ərəb söz və ifadələri, yaxud ərəb dili qaydalarına oxşadılaraq işlədilən söz və ifadələr.

**ƏRƏBLƏŞDİRİLMƏ** "Ərəbləşdirilmək"dən *f.is.*

**ƏRƏBLƏŞDİRİLMƏK** "Ərəbləşdirmək"dən *məch.*

**ƏRƏBLƏŞDİRMƏ** 1. "Ərəbləşdirmək"dən *f.is.*

2. Ərəb hakim millətçilərinin ərəb olmayan xalqları ərəblərin içində əritmə (assimilyasiya etmə) siyasəti.

**ƏRƏBLƏŞDİRMƏK** *f.* 1. Ərəb dilini, adət və ənənələrini qəbul etdirmək, ərəb milləti içərisində əritmək.

2. Dilə çoxlu ərəb söz və ifadələri gətirmək, yaxud ana dilinin söz və ifadələrinə ərəb dili xüsusiyyəti vermək.

**ƏRƏBLƏŞMƏ** "Ərəbləşmək"dən *f.is.*

**ƏRƏBLƏŞMƏK** *f.* Ərəb dilini, adət və ənənələrini qəbul etmək.

**ƏRƏBŞÜNAS** *is.* [*ər.* və *fars.* ...şünas] Ərəb dili və ədəbiyyatı mütəxəssisi, ərəb filologiyası mütəxəssisi.

**ƏRƏBŞÜNASLIQ** *is.* Ərəb dilini, ədəbiyyatını, tarixini və s. tədqiq edən elmlərin məcmusu.

**ƏRƏFƏ** *is.* [*ər.*] Bayramdan əvvəlki gün, bayram axşamı. *Bayram ərəfəsi.* // Hər hansı bir hadisədən qabaqkı vaxt. – [Cəmilə] *özünə həyat yoldaşı intixab etmək ərəfəsində idi.* S.Hüseyn. *Atabəy məmləkətləri müharibə ərəfəsində idi.* M.S.Ordubadi. *Sonra isə o, sanki neft mədənlərində, buruqlar meşəsində itmiş və müharibə ərəfəsində böyük bir mədənin müdiri vəzifəsinə qədər yüksəlmişdi.* Ə.Məmmədxanlı.

**ƏRƏĞAC** *sif.* və *zərf dan.* Tezyetişən, tez əmələ gələn; tez əkilən. *Ərəğac tarla.* – *Yağ, ağaclar çiçək açsın ərəğac; Başını, bəhrə verib, qoy yerə diksin hər ağac.* S.Rüstəm. *Bir qədərdən qoçu qatmaq lazımdır, qoy quzu ərəğac olsun!* S.Rəhimov.

**ƏRƏQ** *is.* [*ər.*] *klas.* 1. Tər. *Ol gülüzardə ərəqin xoş səfası var; Türfə budur ki, saziş edər ataş ab ilə.* Q.Zakir.

2. Bax **araq.** *Yürütməyin ərəqi məclis içrə badə ilə; Həramzadəni qoymun halalzadə ilə.* Füzuli.

**ƏRƏMİK** *sif.* 1. Doğmayan, uzun müddət qısır qalan. *Ərəmik inəkdən öküz olmaz.* (Məsəl). *Kəllər və bəzən ərəmik* (*uzun müddət qısır qalan*) *camışlar iş və nəqliyyat heyvanı kimi istifadə edilir, qocaldıqda, yaralandıqda və s. hallarda isə ətliyə təhvil verilir.* A.Ağabəyli.

2. *məc.* Doğmayan, sonsuz. Ərəmik arvad.

3. Məhsul verməyən, bar verməyən, bərəkətsiz. *Ərəmik yer* (*torpaq*).

4. *məc.* Faydasız, səmərəsiz, nəticəsiz.

**ƏRƏN** *is.* (adətən cəm şəklində). 1. Ər, qoçaq, igid. *Ərənlər kimi döyüşmək.* – *Ərənlər əlindən badə içdinmi? Bulanlıq çayları üzüb keçdinmi?* "Aşıq Qərib". *Əsrlər boyunca ərlər, ərənlər; Hünər dünyasından doymadı, getdi.* S.Vurğun.

2. Dünyagörmüş, müdrik, ağıllı adam. [Həcər:] *Bizlərdə ərənlər üçə deyərlər.* S.Rəhimov.

3. Dini etiqada görə Allaha və övliyalara yaxın olmaq şərəfinə nail olmuş adam. *Çağıraram ərənləri, pirləri; Arzularam bizim əziz yerləri.* Aşıq Rəcəb. *Ərənlər söyləyən, Allah yazanı; Duymadan yox olan imana yazıq!* Ə.Cavad. [Gülsənəm:] *Ərənlər mənə kömək, – deyə qıy çəkdi*: *– Ay ana, mənə kömək!* S.Rəhimov.

4. Mövhumi təsəvvürlərə görə suda yaşayan mövhum bir vücud. *Suya söylə ərən*

*eşitsin, köməyinə çatsın. Yalan desən, səni suyun ərənləri vursun!* (mövhumatçı qadınların dilindən).

**ƏR-ƏR** *is.* [*ər.*] Ardıc ağacı. *Qəddintək nə ər-ər, nə şimşad olur; Onu görcək qəmdən can azad olur.* M.P.Vaqif. *Qəddin şümşadı ər-ərdir, üzün qızılgüldən tərdir...* Rəncur. *Çayın kənarında cərgə ilə boy atmış ər-ərləri guya sünbüllər üstündə qarovul qoymuşdular.* Ə.Haqverdiyev. *Ətrafında ər-ər ağacları düzülmüş xiyabanda bir neçə dəqiqə yol getdik.* M.S.Ordubadi.

**ƏRƏSAT** *is.* [*ər.* “ərsə” söz. cəmi] 1. Dini etiqada görə məhşər (qiyamət) günü yenidən diriləcək insanların öz əməllərinə dair haqq-hesab vermək üçün toplaşacaqları yer, meydan.

2. *məc.* Davalı, iğtişaşlı, gurultulu hadisə haqqında. *A balam, bu nə ərəsatdır.* // *məc.* Gurultulu təntənə, bayram, şənlik. *Küçəyə çıx, gör nə ərəsat var?* ☐ **Ərəsati-məhşər** – bax **ərəsat**. *Bir qiyamət qopurdu ki, lap ərəsati-məhşər.* “Koroğlu”.

**ƏRƏŞ** *is. köhn.* Dirsəkdən barmaqların ucuna qədər olan uzunluq ölçüsü.

**ƏRƏVÜŞ** *is. dan.* Budama, ağacların budağını kəsmə, yan-yörəsini təmizləmə. ☐ **Ərəvüş etmək** – budamaq, budağını kəsmək, yan-yörəsini təmizləmək. *Ağacları ərəvüş etmək.*

**ƏRƏZƏN** *sif. dan.* Gecyetişən, gec əmələ gələn; gec əkilən. *Ərəzən taxıl. – Əkin ki ərəzənə düşdü, məhsul az olacaq.*

**ƏRGƏN** *sif.* Həddi-büluğa çatmış, lakin hələ evlənməmiş və ya ərə getməmiş. *Onun iki ərgən oğlu var. – Ziba hələ bir qədər də subay gəzə bilməzdimi? Yaxud Ziba özü üçün daha münasib bir ərgən oğlan seçə bilməzdimi?* S.Rəhimov. *Rəhmətliyin qızı, adam ərgən oğlana gedəndə bu qədər çəmxəm eləməz ki..* Ə.Vəliyev. *Bəndalı gələndə, elə bil daş-divar da dilə gəlir, deyəsən, ərgən oğlanla zarafatlaşırdı.* Mir Cəlal. ☐ **Ərgən olmaq** – evlənmək və ya ərə getmək vaxtı çatmaq.

**ƏRGƏNLİK** *is.* 1. Həddi-büluğa çataraq, hələ evlənməmiş oğlanın və ya ərə getməmiş qızın hal və keyfiyyəti.

2. Yeniyetmə qız və oğlanların üzündə çıxan sızanaqlar.

**ƏRGİN** *sif.* Əriyib maye halına gəlmiş, ərinmiş, əridilmiş. *Ərgin qurğuşun.*

**ƏRGİNLİK** *is.* Əriyib maye halına gəlmiş şeyin halı.

**ƏRĞƏNUN** *is.* [əsli *yun.*] İçərisində olan borulara körüklər vasitəsilə hava verilərək çalınan klavişli böyük musiqi aləti; orqan. *Ərğənun çalmaq.*

**ƏRİDİCİ** *is. xüs.* 1. Başqa maddələri öz daxilində əridə bilən maddə, məhlul. *Aptek təcrübəsində əridici kimi ən çox su, spirt, efir və yağlar işlənir.* R.Əliyev.

2. Metal əridən fəhlə.

**ƏRİDİLMƏ** “Əridilmək”dən *f.is. Poladın əridilməsi yeni üsulla – sürətli əritmə üsulu ilə başa çatacaqdır.* (Qəzetlərdən).

**ƏRİDİLMƏK** “Əritmək”dən *məch.*

**ƏRİK** *is.* 1. Sarı, ətli, şirin, birçəyirdəkli meyvə və bu meyvənin ağacı. *Ərik ağacı. Ərik qurusu* (qurudulmuş ərik). *Azərbaycan ərikləri sarı, narıncı və qırmızıyanaq olur. – Yay fəslində ərik, gavalı, böyürtkən dəyirdi.* S.S.Axundov. *Ərik və tut ağacları baş-başa verərək günün qabağını çətir kimi tutur, yaşıl otların, tər yoncanın üzərinə sərin kölgə salırdı.* İ.Əfəndiyev. ☐ **Ərik yağı** – əriyin tumundan alınan yağ.

2. *məh.* Cır alça.

**ƏRİKGÜLÜ** *is. bot.* Sarı, çəhrayı və tünd-qırmızıya çalan çiçəkləri olan bitki və onun çiçəyi. *Ərikgülü .. Azərbaycanda bir bəzək bitkisi kimi becərilir.* M.Qasımov.

**ƏRİKLİ** *sif.* 1. Ərik ağacları olan. *Ərikli dərə. – Nəbi bu dəfə özünü ərikli dağına verir.* “Qaçaq Nəbi”.

2. Tərkibində, içində ərik olan. *Ərikli konfet.*

**ƏRİKLİK** *is.* Ərik ağacları olan bağ, ərik bağı.

**ƏRİMƏ** “Ərimək”dən *f.is.*

**ƏRİMƏK** *f.* 1. Hərarətin təsiri ilə bərk, yaxud donmuş haldan maye halına keçmək; ərgin hala gəlmək. *Qar əriyir. Yağ əriyir. – Dağ başında qala var; Əriməyib hələ qar.* (Bayatı). *Ocağın yaxınlığındakı qar yığınları yavaş-yavaş əriyirdi.* Ə.Vəliyev. *Əridi, töküldü hər tərəfdə qar; Söylədim, xoş gəldin, bahar, ay bahar!* M.Dilbazi. // Yanaraq azalmaq. *Şam əriyir. – Eləmi yağ əridi;*

*Piltədə yağ əridi.* (Bayatı). [Turxan bəy:] *Bir şam yanıb, əriyib də sönmək üzrə ikən. Xəyala sığmaz bir şiddət göstərir.* H.Cavid.

2. Məhlulun içində həll olmaq. *Şəkər çayın içində əridi. Duz suyun içində əridi. Toz dərman məhlulun içində əridi.*

3. *məc.* Arıqlamaq, zəifləmək, sınıxmaq. *Xəstə gündən-günə əriyir. Yazıq bir həftənin içində əridi. – Qarı baxdı ki, əvvəlki şahzadə Mütalibdən bir ad qalıb. Elə əriyib ki, lap elə bircə quru nəfəsdi, gedir, gəlir.* (Nağıl). [Böyükxanım:] *Dağ kimi qızım yorğan-döşəkdə əriyib qalıb, rənginə baxmaq olmur.* M.S.Ordubadi. [Çəpəl:] *Qız, bu nə gündür, sınıxıb əriyibsən?* Mir Cəlal. ☐ **Əriyib çöpə (muma, şama) dönmək, əriyib mum (çöp) olmaq** – son dərəcə arıqlamaq. *Axır bu eşq odundan; Əriyib mum olmuşam.* (Bayatı). [Mirzə Turab:] *Mən sizin dərdinizi çəkməkdən əriyib çöpə döndüm.* B.Talıblı. [Yaqub] *burada onsuz da əriyib şama dönmüşdü.* S.Vəliyev. **Şam (mum) kimi ərimək** – gündən-günə arıqlamaq.

4. *məc.* Utanmaq, xəcalət çəkmək. *Heç ərimirsən? Sənin yerinə mən əriyirəm. – Böhtanını geriyə ud! Əriyərsən bir sözümdən.* S.Vurğun.

5. *məc.* Yavaş-yavaş yox olub getmək, çəkilmək, çəkilib-getmək, itib-getmək, duyulmaz olmaq. *Zülmət əridi. Qaranlıq əriyir. – Qanadlar yavaş-yavaş əriyib axırda tamam yox oldular.* "Koroğlu". *Hamı sakit durub xortdanın əriyib məhv olmasını gözləyirdi.* B.Talıblı. *Gecənin nə cür əridiyindən xəbər tutmayaraq birdən səhərin soyuq nəfəsini hiss etdik.* Ə.Məmmədxanlı.

6. *məc. dan.* Ürəyinə yatmaq, ləzzət almaq, həzz almaq, valeh olmaq.

7. *məc. dan.* Cürbəcür yollarla işə verilmək, satılmaq. *Bu yollarla çox mallar əridi.*

**ƏRİMƏZLİK** *is.* Əriməyən şeyin hal və keyfiyyəti.

**ƏRİNCƏK** *sif.* Tənbəl, kahal, başısoyuq, canını işə verməyən. *Şişman məmur uzun bir sükutdan sonra ərincək* (z.) *halda ağır-ağır sözə başladı.* M.Hüseyn.

**ƏRİNCƏKLİK** *is.* Tənbəllik, kahallıq, canını işə verməməzlik.

**ƏRİNGƏN** b a x **ərincək**.

**ƏRİNİK** 1. B a x **ərincək**.

2. Ərimiş, ərgin.

**ƏRİNMƏ** "Ərinmək"dən. *f.is.*

**ƏRİNMƏK** 1. *f.* Tənbəllik etmək. *Durmağa ərinmək. Hətta danışmağa ərinir.* – [Rüstəm kişi] *..samovara su tökməyə, kömür salmağa ərindi.* M.İbrahimov. *Bəzi tənbəl uşaqlar səhər-səhər isti yorğan-döşəkdən çıxmağa ərinir.* M.Rzaquluzadə.

2. *məch.* Ərgin hala salınmaq.

3. *t-siz.* Arıqlamaq, çox sınıxmaq.

4. *t-siz.* Utanmaq, xəcalət çəkmək. *Elə sözlər dedi ki, ərinib torpağa girdim. – Dostunla görüşməyə; Yad kimi ərinmə, gəl.* (Bayatı). *Biz də hamımız onun yanına getməyə ərindik.* S.Rəhimov. *Kərbəlayı ..* [uşağı] *bir neçə addım aşağıya tərəf qovduqdan sonra ərinib dayandı.* M.Hüseyn.

**ƏRİNMƏZ** *sif.* Ərinməyən, tənbəllik etməyən.

**ƏRİNMƏZ-ƏRİNMƏZ** *zərf* Utanmadan, həyasızcasına, sırtıq-sırtıq. *O məni görüb söyər, bəzən də ərinməz-ərinməz yüyürüb məni tutar.* M.Hüseyn.

**ƏRİNMİŞ** *f.sif.* 1. Əridilərək saflaşdırılmış; ərgin. *Ərinmiş yağ* (sarı yağ).

2. Əridilmiş. *Ərinmiş qurğuşun.*

**ƏRİNTİ** *is. tex.* İki və ya bir neçə metal (yaxud başqa cisimlər) əridildiyi zaman onların qarışması nəticəsində alınan xəlitə. *Yüngül ərintilər. Qızıl ilə mis ərintisi. – Təyyarələrin qanadını yüngül ərintilərdən hazırlamaq üçün on minlərlə qaynaq etmək tələb olunduğu halda, plastik kütlədən bütöv qanadlar hazırlanır.* P.Rüstəmov.

**ƏRİŞ** *is. toxuc.* Xalçada və başqa toxunma mallarda uzununa müvazi gedən əsas iplər. *Xananın ərişi. – Toxunmalar üçün işlənən saplar, başlıca olaraq, iki qrupa ayrılır*: 1) *əriş sapları;* 2) *arğac sapları. Bunlardan birincisi toxunmaların boyu, ikincisi eni üçündür.* Ə.Quliyev.

**ƏRİŞ-ARĞAC** *is. toxuc.* Əriş və arğac, ərişlə arğac birlikdə.

**ƏRİŞLƏMƏ** "Ərişləmək"dən *f.is.*

**ƏRİŞLƏMƏK** *f. toxuc.* Xananın əsas iplərini çəkmək.

**ƏRİŞLİK** *sif. toxuc.* Ərişə yarayan, əriş üçün olan. *Ərişlik ip.*

**ƏRİŞMƏK** *f. dan.* Sataşmaq. *Gahdan qalxır, uşaqlara ərişir; Abırından, saqqalından utanmır.* Aşıq Hüseyn.

**ƏRİŞTƏ** *is.* [*fars.*] 1. Nazik-nazik kəsilib qurudulmuş xəmir parçalarından ibarət məmulat. *Əriştə bəylər aşı; Quymaq onun yoldaşı.* (Ata. sözü). *Dilbər pəncərə arasına qoyulan məcməyidəki əriştəni götürüb ocaq üstündə pıqqapıqla qaynayan qazana tökdü.* Ə.Sadıq.

2. Bu xəmir parçalarından bişirilən sulu xörək, şorba. *Əriştə şorbası.*

◊ **Əriştə doğramaq** *məc.* – bir işi görmək üçün gizli hazırlıq aparmaq. *Özünə umac ova bilmir, özgəsinə əriştə kəsir.* (Ata. sözü). [Səfər:] *İndi* [Həmzə və Çimnaz] *əriştə doğrayırlar, amma qız heç razı deyil.* C.Cabbarlı.

**ƏRİŞTƏÇİ** *is. köhn.* Əriştə bişirib satan adam.

**ƏRİŞTƏÇİLOV** *is. aşp.* Əriştə xəmirləri qovrulduqdan sonra, düyü ilə qarışdırılıb bişirilən xörək.

**ƏRİŞTƏLİ** *sif.* Tərkibində əriştə olan, əriştə qarışığı olan. *Əriştəli plov.*

**ƏRİŞTƏLİK** *sif.* Əriştə kəsmək üçün hazırlanan, əriştəyə yarar. *Əriştəlik xəmir. Əriştəlik un.*

**ƏRİŞTƏPLOV** *is. aşp.* Əriştə ilə düyüdən bişirilən plov.

**ƏRİTDİRMƏ** "Əritdirmək"dən *f.is.*

**ƏRİTDİRMƏK** "Əritmək"dən *icb. Yağı əritdirmək.*

**ƏRİTMƏ** "Əritmək"dən *f.is. Əritmə sexi.*

**ƏRİTMƏK** *f.* 1. Hərarət təsiri ilə bərk, yaxud donmuş halda olan şeyi maye halına salmaq. *Yağ əritmək. Qır əritmək. Mumu əritmək. Qurğuşunu əritmək. Buzu əritmək.* – [Xoca Əziz] *ocağı asıb qır-saqqızı tökdü tiyana, əridib elədi mum kimi.* "Koroğlu". *Dağda ərit qarları; Bağda ərit qarları.* M.Ə.Sabir. *Qərənfil xala yağı əritmək üçün sapılcanı ocağın üstünə qoydu.* Ə.Vəliyev.

2. Həzm etdirmək, həll etmək. *İstisu xörəyi yaxşı əridir.* – [Bürcəliyev:] *Əritməkdə, həzmə verməkdə bu Ağbulaq turşsuyunun əsla misli-bərabəri yoxdur.* S.Rəhimov.

3. İşə getməyən malı cürbəcür yollarla işə vermək, satmaq. *Köhnədən qalan malları əritmək. – O, möhkəm inanır ki, iki ton buğdanı lap iki həftədə əridər.* "Kirpi".

4. *məc.* Arıqlatmaq, üzmək; arıqlamasına, zəifləməsinə, əldən düşməsinə səbəb olmaq. *Nola qeyrət atəşi canım əritsə mum tək.* Füzuli. *Gürşadı əridən araqla papiros idi.* Ə.Vəliyev.

5. *məc.* Utandırmaq. *Sözlərim onu utandırıb əritdi.*

6. *məc.* Yavaş-yavaş batırmaq. *Gözümdən günlər keçir əsrlərə bərabər; Zülmətləri əridən, qaynar şəfəqli günlər.* R.Rza. *Tiflis üzərində boranlı bir qış günü qanadlarını geniş açıb, ətrafı qəmgin bir yalqızlıq içində əridirdi.* M.Hüseyn.

7. *məc.* Hiss edilmədən keçirmək. *Sonralar o, gecələrini bu çırağın işığında əridər və sübhə kimi kənddə yalnız bu pəncərədən işıq çəkilməzdi.* Ə.Məmmədxanlı.

8. *dan.* Xərcləmək, korlamaq, israr etmək (əsasən pul haqqında). *Varis hər dəfədə uduzmağa və pulları əritməyə başladı.* A.Şaiq.

**ƏRİYİCİ** *sif.* 1. Maye və s. içində əriyə bilən, həll ola bilən. *Əriyici maddə.*

2. Asanlıqla əriyən, tezəriyən. *Əriyici metal.*

**ƏRİZƏ** *is.* [*ər.*] *rəs.* Bir arzu və ya xahiş ifadə edən məktub, yazılı müraciət. *Ərizə vermək. Müdirin adına ərizə yazmaq. – Bir baş çəkin dərdiməndin halına; Ərzə yazsın, qələm alsın əlinə.* M.V.Vidadi. [Kərbəlayı:] *Hökumətdən narazısınız, ərizə yazın.* H.Nəzərli. *İkram maarif nazirliyinə ərizəni tək yazmışdı.* Ə.Əbülhəsən.

**ƏRİZƏBAZ** *is.* [*ər.* ərizə və *fars.* ...baz] Müxtəlif idarələrə, təşkilatlara və s.-yə daha çox yalandan, çox vaxt böhtan məqsədi ilə ərizə yazmağı özünə peşə etmiş adam. *Ərizəbazın biridir. Ərizəbazları ifşa etmək.*

**ƏRİZƏBAZLIQ** *is.* Ərizəbazın işi, peşəsi. *Ərizəbazlıqla məşğul olmaq. Ərizəbazlıq işimizə mane olur. – Ərizəbazlıqla hərbi xidmətdən qurtara bilməyən İmanzadəyə, nəhayət, bir təsadüf kömək etdi.* Ə.Əbülhəsən.

**ƏRİZƏÇİ** *is.* 1. Ərizə verən, ərizə ilə müraciət edən adam; şikayətçi. *Ərizəçi öz ərizəsinə imza etdi. Ərizəçilərin qəbulu. –* [Eşikağası:] *Qədir bəy, ərizəçiləri növbət ilə qabağa gətir.* M.F.Axundzadə. [Kəndli:] *Hövsələli ol, a kişi, gəlin bu tərəfə, elə biz də sizin tək ərizəçiyik.* P.Makulu.

2. *köhn.* Keçmişdə pulla ərizə yazan adam.

**ƏRİZƏÇİLİK** *is.* 1. Bax **ərizəbazlıq.** *Ərizəçiliklə məşğul olmaq.*

2. *köhn.* Keçmişdə savadsız adamlara pulla ərizə yazma peşəsi. *Ərizəçiliklə güzəranını keçirmək.*

**ƏRİZƏYAZAN** *is. köhn.* Keçmişdə savadsız adamlar üçün pulla ərizə yazan adam.

**ƏRK**[1] 1. *is.* Bir şəxsin yaşca böyüklüyü, yaxın qohumluğu, yaxud dostluğu səbəbi ilə başqa birisi ilə sərbəstcə davranmasına, rəftar etməsinə (söz deməsinə, nəsihət verməsinə, məsləhət verməsinə, acıqlanmasına və i.a.) yol verən yaxınlıq münasibəti. *Bəyimin ərki və gileyi Məmməd bəyi oxşadı.* Çəmənzəminli. *Qonşu, sizə bir söz deyəcəyəm, ya ərk bilin, ya da tənqid sayın.* Mir Cəlal. □ **Ərk etmək (eləmək), ərki çatmaq (yetmək)** – həmin münasibətə əsasən özünə yaxın bilib dostcasına bir şey etmək, demək, öz adamı bilmək. [Gəray:] *Yar sənə ərk edərək əyləndi; Qəlbinə sevgi səfası endi.* A.Şaiq. *Tükəz arvad ərki yetənləri getməyə qoymadı..* Ə.Əbülhəsən. *Ərk edib guya sənə; Zəng vuracaq evinə.* Z.Xəlil.

2. *zərf* **Ərklə** şəklində – ərk edərək, ərk edərcəsinə. *Salman ərklə əlini uzatdı, Aslan isə dayanıb baxdı.* S.Rəhimov. *İmran kişi əlini qaldırıb ərklə* [Tahirin] *dizinə çırpdı.* M.Hüseyn. *Sona ərklə stəkanı* [Qadirin] *əlindən aldı..* Ə.Əbülhəsən.

**ƏRK**[2] *is.* İç qala, möhkəm hasar. *Laxlayan daş ərkdə qalmaz.* (Ata. sözü).

**ƏRKAN** *is.* [*ər.* "rükn" söz. cəmi] *top.* 1. Yüksək vəzifəli dövlət məmurları, dövləti idarə edən adamlar. *Onun qabağında tamam ərkani-dövlət durmuşdular.* M.F.Axundzadə. *Hökumət ərkanının ciblərini doldurmaq sayəsində İskəndər bəy dağlarda padşahlıq edirdi.* Ə.Haqverdiyev. [Hacib:] *Alp Arslan ətrafını saran saray ərkanı və ordu ilə bərabər gələr.* H.Cavid.

2. *məc. dan.* Ədəb qaydaları; rəsm, adət. *Hər kəsin ərkanı var; Oduna gedənin örkəni.* (Ata. sözü). *Bu necə adətdir, necə ərkandır?* M.P.Vaqif. *Adam var ki, yol, ərkanı bəyənməz.* Aşıq Abbas.

**ƏRKANLI** *sif. dan.* Ədəbli, qanacaqlı, ədəb gözləyən, ciddi.

**ƏRKANSIZ** *sif.* 1. Dinsiz, imansız.

2. Söyüş, qarğış məqamında işlənir. *Yassar qışqırdı*: *– Ay ərkansızın qızı, bəri qayıt, vurdum!* Mir Cəlal.

**ƏRKƏ** *is.* Uşaq, çocuq, tifil. [Bəypolad:] *Miskin bir ərkəyə rast gəlsəm, dərhal sinirlərimə toxunur.* H.Cavid.

**ƏRKƏSÖYÜN** *is.* Ərköyün, xudpəsənd, özünü sevən. *Xanım Balacayeva Əlisanın kənara sürütlədiyi peçi qalamaqla məşğul olduğundan, Gülöyşə ərkəsöyün adam kimi o biri otağa keçdi.* S.Rəhimov.

**ƏRKƏVAN** *is. bot.* Paxlaya oxşar meyvəsi, parlaq çəhrayı rəngli çiçəkləri olan, qışda yarpağı tökülən ağac, ya kol. *Ərkəvan 7-8 metr hündürlükdə, qışda yarpağı tökülən ağac və ya koldur.*

**ƏRKLƏMƏ** "Ərkləmək"dən *f.is.*

**ƏRKLƏMƏK** *f.* Əzizləmək, ərköyün öyrətmək.

**ƏRKLƏNMƏ** "Ərklənmək"dən *f.is.*

**ƏRKLƏNMƏK** *məch.* Ərköyün böyüdülmək, əzizlənmək.

**ƏRKLİK** *is.* Ərk etmə, yaxınlıq. *Ərkliklə* (z.) *gəlmişdim ki, səni qardaşınla barışdırım.*

**ƏRKNAZ** 1. *is.* Naz, qəmzə. *Öldüm nazın çəkməkdən; Belə ərknaz olmaz.* (Bayatı). *Yar inciyib küsəndə onun başqa zövqü var; Hərdənbir ortalıqda gərək ərknaz ola.* Ə.Vahid.

2. *zərf* **Ərk-nazla** şəklində – nazla, nazlana-nazlana, qəmzə ilə. *..Məşuqə qalib bir sərkərdə kimi qürurla dayandı, sonra cazibəli gözlərini ərk-nazla dolandırdı.* S.Rəhimov.

**ƏRKÖYÜN** *sif.* Həddindən artıq əzizlənmək, bütün arzu və şıltaqları yerinə yetirilməsi nəticəsində xudbin böyümüş. – *Ərköyün uşaq. Ərköyün* (z.) *böyümüş övlad.* – *Ananın ərköyün oğlu hambal olar.* (Ata. sözü). [Sərvinaz xanım:] *Onun tək qalmağına görə mən onu bir az ərköyün* (z.) *saxlamışam.* N.Vəzirov. *Beş qardaşın yalnız bir bacısı olduğundan, ata-ana onu ərköyün* (z.) *böyütmüşdü.* A.Şaiq.

**ƏRKÖYÜNCƏSİNƏ** *zərf* Ərköyün kimi, xudbincəsinə.

**ƏRKÖYÜNLƏŞMƏ** "Ərköyünləşmək"-dən *f.is.*

**ƏRKÖYÜNLƏŞMƏK** *f.* Ərköyün olmaq, həddindən artıq əzizlənmək, hər bir arzu və

şıltağı yerinə yetirilmək nəticəsində xudbin olmaq.

**ƏRKÖYÜNLÜK** *is.* Ərköyün adamın hal və keyfiyyəti; xudbinlik. *Evdəki ərköyünlük əlamətləri məktəbin ciddi tələbləri qarşısında ərimәyə başlayırdı.* S.Rəhimov.

**ƏRKYANA** *zərf* Ərki olan adam kimi, ərk edərək, ərklə, özünə çox yaxın bilərək. *Bayram kişi ərkyana* [cavanı] *danladı*: *– Yaxşı, nə quruyub durmusan. Gəl otur, üzüm ye, söhbət elə.* M.Rzaquluzadə. *Bəbir bəy ərkyana bir ahənglə üzünü qadına tərəf tutub deyirdi*: *– Qumru bacı, bunu ayrı yerdə deyib, camaatı özünüzə güldürməyin.* Mir Cəlal. *Şüşə tək sınmış eşitdim xatirin məndən, gülüm! Söylədim, gəzmə rəqibimlə, sənə ərkyanə mən.* Ə.Vahid.

**ƏRQƏVAN** *is.* [*fars.*] *şair.* Qırmızı rəngli gözəl bir gül (klassik şeirdə gözəlin dodağı bu çiçəyə oxşadılır). *Səmən iyli, səhabi zülf, ay qabaq; Qönçə dəhan, dürr diş, ərqəvan dodaq.* M.P.Vaqif.

**ƏRQƏVANİ** *sif.* [*fars.*] *şair.* Ərqəvan çiçəyi rəngində, qırmızı və parlaq. *Öldürdü məni qəmi-nihani; Yoxdurmu şərabi-ərqəvani?* Füzuli.

**ƏRLİ** *sif.* Əri olan. *Ev tikdirənlər təkcə ərli qadınlar deyildi.* Ə.Əbülhəsən. // *İs. mənasında.* Ərli qadın. *Ərlilərin əri var; Dulların da Allahı.* (Ata. sözü).

**ƏRLİ-ARVADLI** *zərf.* Ərlə arvad bir yerdə; bütün ailəliklə.

**ƏRLİK** *is.* 1. Ərin öz qadınına olan münasibəti, vəzifəsi, haqqı. *Onun ərliyindən nə olacaq? Ərliyə qəbul etdi.* – [Şah Abbas:] *Əgər sizdən hər biriniz .. Abbas Məhəmməd oğlunu ərliyə qəbul edirsə, təzədən bu ibarət ilə ona siğeyi-nikah oxutdurram.* M.F.Axundzadə. *..Müqim bəy getdikcə Zərrintac xanımın ərliyindən tamamilə çıxıb, .. saqqalı taxıl tozuna bulanmış dərğalarından birinə çevrilirdi.* S.Rəhimov.

2. Mərdlik, qoçaqlıq, namusluluq. *Ərlik göstərmək. – Bəylərimizə dəmirdonlu deyərlər; Daim içimizdə ərlik işlənir.* "Koroğlu".

3. *sif.* Ərə getmək vaxtı çatmış. *Ərlik qız. Ərlik vaxtı* (qızın ərə getmə vaxtı, həddibüluğa çatdığı vaxtı). *– Dilşadın .. təşkilata girməsi, ərlik qız ikən oğlanlarla gəzməsi – bütün bunlar Kərbəlayı Əzimin boynuna vəzifə qoyur.* T.Ş.Simurq. *Ərlik yekə qızdır, deyirəm, get ərə, getmir.* Ə.Nəzmi.

**ƏRLİLİK** *is.* Əri olan qadının hal və vəziyyəti.

**ƏRMƏĞAN** *is.* [*fars.*] bax **armağan**. *Əzəl başdan Bəsrə, Bağdad eliniz; Bəylər üçün ərməğandır teliniz.* M.V.Vidadi. [Dərviş:] *Arzusunu çəkdiyim zat məni doydurdu, könül usandı, özgə bir ərməğan axtarmaq xəyalından nə xilas və nə də doya bildim.* A.Divanbəyoğlu. *Ərməğanım yaslı nəğmə; Bir quş oldum, çıxdım yola..* Ə.Cavad.

**ƏROV** *is.* Çirkli, sabunlu paltar suyu. *Ərov axıb gəlib qapının yanında göl durmuşdu.* C.Məmmədquluzadə.

**ƏRP** *is.* 1. Sirkənin, abqoranın və s.-nin üzərinə yığılan çirkli qəliz maye qatı.

2. İçində su qaynadılan qabların dibində və divarlarında daşlaşan, həll olmayan duzlar çöküntüsü. *Buxar qazanından ərpi təmizlədilər. Çaydan ərp bağlayıb.*

3. Daranarkən başdan tökülən kəpək, qovaq. *Darağın dibi ərplə doludur.*

4. Dişlərin dibində əmələ gələn çöküntü. *Dişi ərp tutub.* // Bəzi boğaz xəstəliklərində əsnək üzərində əmələ gələn sərt pərdə. *Xəstənin əsnəyi qızarır və şişir, bozumtul ağ rəngli ərp əmələ gəlir.*

**ƏRPLƏNMƏ** "Ərplənmək"dən *f.is.*

**ƏRPLƏNMƏK** *f.* Üstü ərplə örtülmək, ərp bağlamaq. *Sirkənin ağzı açıq qalanda ərplənir. Çaydanın divarları və dibi ərplənmişdir.*

**ƏRRADƏ** *is.* [*ər.*] *köhn.* 1. Təkərlər üzərində yerləşdirilmiş top, mancanaq və s. altlığı. *Çəkilməkdə ərradədə tuplər; Təbillərdə fəryad gup-guplər.* M.Ə.Sabir.

2. Araba. *Aşura günü tək bir səhər çağı; Yığdı ərradəyə övrət, uşağı.* Q.Zakir.

**ƏRRƏ** *is.* [*fars.*] İkidəstəli iri mişar, bıçqı. *Kərki olub öz tərəfinə yonma; Ərrə ol, iki tərəfə yon.* (Ata. sözü).

**ƏRRƏÇİ** *is.* Mişarçı, bıçqıçı.

**ƏRSƏ** *is.* [*ər.*] 1. Meydan, açıq yer, boş yer; düzən. *Bir ərsədə hər əsər ki gördüm; Sənsən deyib ol əsər, yügürdüm.* Füzuli. *Mahi-rəmazandır, yenə meydan da bizimdir; Meydan da bizim, ərsədə cövlan da bizimdir.* M.Ə.Sabir.

◊ **Ərsəyə gəlmək** – meydana gəlmək, ortalığa çıxmaq. *Bir cavan təzədən gəlib ərsəyə; Əcayib oğlandır, adı Məhəmməd.* M.P.Vaqif.

2. Kamala yetmə, müstəqil həyat sürməyə başlama.

◊ **Ərsəyə çatmaq** – kamala yetmək, böyümək. [Dövlətlilər] *boy atıb ərsəyə çatmamış alverə elə qurşanırdılar ki, .. heç bir peşə öyrənməyə də fikir verməyə macalları olmurdu.* Ə.Əbülhəsən. **Ərsəyə yetirmək (çatdırmaq)** – böyütmək, yetişdirmək, ortalığa çıxartmaq. **Ərsəyə yetmək (çatmaq)** – böyümək, kamala çatmaq, müstəqil həyat sürməyə başlamaq.

**ƏRSƏMƏK** *is. qəd.* Böyümək, kamala çatmaq. *Ərsəmiş nər öldürdün; Qanlısan, gözəl maya.* (Bayatı).

**ƏRSİN** *is.* Xəmir işlərində və s.-də işlədilən dəmir kürəkcik şəklində alət. *Təknədən xəmiri ərsinlə qazımaq. – Hər sözü təlim eləyir tərsinə; Dəyməz o bir paslı dəmir ərsinə.* M.Ə.Sabir.

◊ **Ərsinlə qazıyıb çıxarmaq** – güclə, çox zəhmət çəkərək çıxarmaq, rədd etmək. [Mürşüd:] *Yox, Sadıq, mənim arvadımı sən yaxşı tanımırsan, bir məsələ ki onun beyninə girdi, ərsinlə qazıyıb çıxarmaq olmaz.* S.Rəhman.

**ƏRSİNLƏMƏ** "Ərsinləmək"dən *f.is.*

**ƏRSİNLƏMƏK** *f.* Ərsinlə qazımaq (qazıyıb çıxarmaq). *Qazanın dibini ərsinləyib qazmaqları çıxarmaq.*

**ƏRSİNLƏNMƏ** "Ərsinlənmək"dən *f.is.*

**ƏRSİNLƏNMƏK** *məch.* Ərsinlə qazınıb çıxarılmaq.

**ƏRSİZ** *sif.* Əri olmayan, dul. *Ərsiz qadın. – Bir bölük atlar; Çəməndə otlar; Ərsiz arvadlar; Bu balama qurban.* (Bayatı). *Mən* [qızın] *ailəsiz, ərsiz* (z.), *çocuqsuz olduğunu zənn edirdim.* S.Hüseyn.

**ƏRSİZLİK** *is.* Ərsiz qadının hal və vəziyyəti; dulluq.

**ƏRŞ** *is.* [*ər.*] *şair.* Göy, asiman. *Təsbeh kimi qatarınız düzərsiz; Havalanıb ərş üzündə süzərsiz.* M.V.Vidadi. *Müqtədirsən ucalıb ərşə qədər getməyə də; Cənnəti, həm də cəhənnəmləri seyr etməyə də.* A.Səhhət.

◊ **Ərşə bülənd olmaq** – b a x **ərşə çıxmaq.** [Qərib:] *Səbrə taqətim yox, gəlməz qərarım; Ərşə bülənd olub ah ilə zarım.* "Aşıq Qərib". **Ərşə çıxmaq** – ucalmaq, göylərə qalxmaq. *Göy üzündə açanda biz qanadı; Ərşə çıxar yağıların fəryadı.* R.Rza. **Ərşə dayaq olmaq** – b a x **ərşə dayanmaq**. **Ərşə dayanmaq** – b a x **ərşə çıxmaq**. *Fərraşların küçələrdə səsi hər dəqiqədə ərşə dayandı.* M.F.Axundzadə. **Ərşə qalxmaq** – b a x **ərşə çıxmaq**. *Məzlumların ah və naləsi ərşə qalxdı.* C.Məmmədquluzadə. **Ərşə ucalmaq** – b a x **ərşə çıxmaq**. *Zülfün qəmi bir halə salıbdır məni, ey məh! Naləm ucalır ərşə şəbi-tar gələndə.* S.Ə.Şirvani. **Ərşi-əla** *şair.* – uca göy, səma, asiman. *Hər düşəndə qəddin yada, ağlaram; Ünüm çıxar ərşi-əlayə, pəri!* M.P.Vaqif. **Ərşi-fələk** – b a x **ərşi-əla**. [Ağamərdan:] *Əyər bu iş mən deyən kimi baş tutsa, Təbrizdə mənim şöhrətim ərşi-fələkə çıxacaq.* M.F.Axundzadə. *Hələ dan ulduzu batmayıb ərşi-fələkdə öz dövrünü edirdi.* A.Divanbəyoğlu. **Ərşi-müəlla** *şair.* – b a x **ərşi-əla**. *Arizin gün əvəzi aləmi nurani edər; Gər mələklər çəkələr ərşi-müəllayə səni.* S.Ə.Şirvani. **Başı ərşə durmaq (qalxmaq, dayanmaq)** – çox uca, hündür, yüksək şey haqqında. [Nigar:] *Başı ərşə duran dağlar; Dağlar, Eyvazı neylədiz?!* "Koroğlu".

**ƏRUS** *is.* [*ər.*] Gəlin; yeni ərə getmiş və ya getmək üzrə olan qız. *Bu gün sən özünə ərus gətirirsən.* C.Məmmədquluzadə. [Gürcülər:] *Oyan, ərusi-növbahar! Ayıl, ey afəti-cahan! Oyan, Xumar!..* H.Cavid.

**ƏRUZ** *is.* [*ər.*] 1. Şeir vəznlərindən (ölçülərindən) bəhs edən elm. *Əruz elmi.*

2. Ritmik hecalardan, yəni qısa mədli hecalarla uzun mədli və ya qapalı hecaların müntəzəm düzülüşündən əmələ gələn şeir vəzni. *Əruz vəzni.*

**ƏRVAH** *is.* [*ər.* "ruh" söz. cəmi] Ruh. *Məcnun ilə Leyliyi qılıb yad; Ərvahlarını eylədin şad.* Füzuli. *Biçarə münəccimbaşının ərvahı uçub, başladı yarpaq kimi titrəməyə.* M.F.Axundzadə.

**ƏRVƏZ** *is. məh.* İməcilik.

**ƏRZ**[1] *is.* [*ər.*] 1. Yer (*səma* müqabili). *Ərzü səmadə yoxdur bir zərrə səndən ayru.* Nəsimi. *Sanki ərz kürəsi vulkanları, zəlzə-*

*ləri, daşqınları ilə ölmədə idi.* H.Nəzərli. ◻ **Ərzdən-səmaya qədər** *köhn.* – Yer ilə göy qədər. *Dünənki gün də gün idi, bu gün də bir gündür; Vəli təfavütü var ərzdən-səmayə qədər.* S.Ə.Şirvani.

2. Dünya, Yer üzü. *Ərzin bu gözəl feyzinə son yox.* M.Müşfiq. *Ərzin iqbalını bizik düşünən.* M.Rahim. // *köhn.* Məmləkət, ölkə, diyar.

**ƏRZ**[2] *is.* [*ər.*] 1. *klas.* Təqdim etmə, önünə qoyma, göstərmə; izhar. ◻ **Ərz etmək (qılmaq)** – təqdim etmək. *Daşə çəkmiş xəlq üçün Fərhad Şirin surətin; Ərz qılmış xəlqə məhbubin, əcəb biar imiş.* Füzuli.

2. *köhn. dan.* Söylənilən, nəzərdə tutulan fikir, söz, mətləb. *Ərzimi başa düşmədin. Ərzimə mültəfit ol. Ərzimə qulaq ver.* ◻ **Ərz etmək (eləmək)** – bildirmək, anlatmaq, məlum etmək, ifadə etmək. *Əhvalatı ərz etdi.* – [Həsən bəy:] *Xeyr, Məşədi İbad, ərz eylədim ki, çirkindir.* Ü.Hacıbəyov. *Yazıq muzdur qolu boynunda sınıqçıdan qayıdıb birbaşa öz xozeyninin yanına gəldi və başına gələn qəziyyəni ərz etdi.* S.M.Qənizadə. [Məşədi Qədir:] *Bəli, ərz eləyirəm, yatmışıq, heç şeydən xəbərimiz yoxdur.* T.Ş.Simurq. **Ərz olsun...** – məlum edirəm ki, nəzərinizə çatdırıram ki... (hörmətlə müraciət). *Ərz olsun, məlaikələr padşahının qızı bir birə olub, Qəmərin qoynuna girdi, onu sancdı.* (Nağıl). **Ərz olunmaq** – deyilmək, anladılmaq, məlum edilmək, ifadə olunmaq.

3. Acizanə şikayət, xahiş, rica. *Ərzim var. Ərzimə qulaq as. – Mixək əkdim mərzə mən; Bağlamadım dərzə mən; Bivəfa yar əlindən; Kimə gedim ərzə mən?* (Bayatı). *Bizdən həqqə ərzlər yetirdin; Həqdən bizə müjdələr gətirdin.* Füzuli. [Dilmanc:] *..Qoy ərzin qalsın sonraya və bu saat get, oğlun Süleymanı gətir naçərnikin qulluğuna.* C.Məmmədquluzadə.

**ƏRZ**[3] *is.* [*ər.*] *köhn.* 1. En, genişlik (*tul* müqabili).

2. *coğr. köhn.* En dairəsinin köhnə coğrafiya kitablarındakı adı.

**ƏRZAQ** *is.* [*ər.* "rizq" söz. cəmi] Yeyiləcək şeylər, yeyinti məhsulları. *Ərzaq ehtiyatı. Ərzaq bolluğu. Ərzaq mağazası. Ərzaq anbarı. – Ağanın pambıq, ərzaq və xuşgəbar karvanının başı, ayağı məlum olmayırdı.* Ə.Haqverdiyev. *İraq və Bağdad qoşunu bütün qərargahını və ərzaq şeylərini, silah və yük mallarını buraxıb nizamsız və pozğun bir surətdə qaçmışdı.* M.S.Ordubadi. *Biz çalışırıq ki, nə qədər mümkünsə, ərzaq şeylərimiz çox olsun.* M.İbrahimov.

◊ **Ərzaq sapalağı** *tar.* – Rusiyada 1918-1921-ci illər hərbi kommunizm dövründə ərzaq tədarükü sistemi.

**ƏRZƏN** *sif.* Gecikmiş, dünyaya gec gəlmiş, gec yetişmiş.

**ƏRZ-HAL** [*ər.*] bax **ərizə**. *Və qələm götürdüm, ərz-hal yazıb Tiflis qubernatoruna verdim.* C.Məmmədquluzadə. *Şükür əvvəllərdə Güləlinin əsgərliyə alınmasını bir yanlışlıq zənn etmişdi. Hətta onun anasının dilindən mərkəzə bir ərz-hal da yazmışdı.* S.Hüseyn. [Ədalət:] *Mən sənə xəbər göndərmişdim, nə üçün ərz-halını yazdırıb gətirməmisən?!* Ə.Məmmədxanlı.

**ƏRZİNDƏ** *zərf* İçərisində, müddətində. *Üç gün ərzində. Bir il ərzində. Bu iki həftənin ərzində. – O qədər ləziz xörəklər ki bircə ramazan ayında ortalığa gəlir, qeyri bu bir ayın ərzində gəlmir.* C.Məmmədquluzadə. *Muzdur Məşədi Əsgər iyirmi səkkiz ilin ərzində su ilə od arasında bişib-bərkidikdə əsla azar-bezar bilməzdi.* S.M.Qənizadə.

**ƏSA** *is.* [*ər.*] Əl ağacı. *Çiyninə aldı bir lətif əba; Əlinə aldı bir zərif əsa.* S.Ə.Şirvani. *Molla Kərim də dişlərini qıcırdıb, əsasının şiş ucu ilə çuvalın o yan-bu yanına bir-iki dəfə vurdu.* B.Talıblı. *Hacı Rəsul, qonağın əsasını alıb divara söykəmək istədi.* Mir Cəlal.

**ƏSALI** *sif.* Əlində əsa olan. *Anamdır, – deyə Qeybalı alacalanmış gözləri ilə boz adamları süzüb dəmir əsalı adama cavab verdi.* S.Rəhimov.

**ƏSARƏT** *is.* [*ər.*] 1. Əsirlik, köləlik, qulluq; kölə, qul vəziyyəti. *Əsarət zənciri. Əsarətdən qurtarmaq. – ..Zahiri əsarətdən xilas olduğumuz kimi, batini əsarətdən də xilas olmalıyız.* C.Məmmədquluzadə.

2. *məc.* Qəfəs, zindan, dustaqlıq. *Quş əsarətə çox tez alışdı. – Könül bir quşdur ki, sevməz əsarət; Daim çırpınır, istəyir hürriyyət.* A.Səhhət. *Qaratoyuq əsarətə tez öyrənişir, sonra oxumağa başlayır, hətta onu tar ilə oxumağa öyrədirlər.* S.S.Axundov.

**ƏSAS** *is.* [*ər.*] 1. Bünövrə, özül, bina, təməl. *Evin əsası çox möhkəmdir.* // *məc.* Bir şeyin özülünü, təməlini, özəyini təşkil edən şey; kök. *Operanın əsasını xalq dastanı təşkil edir.*

2. *Sif. mənasında.* Başlıca, ən mühüm, zəruri. *Əsas əlamət. Əsas səbəb. Əsas məsələ. Ağacın əsas budağı. Əsas qüvvələr. Əsas iş yeri. İnkişafın əsas mərhələsi. Əsas şərtlər.* – *Xilqətin əsası olan analıq duyğusunun bəzi qadınlara yabançı olması həyatın anlaşılmaz sirlərindən biridir.* M.İbrahimov. *Səriyyə xalanın Qərənfilə müştəri gözü ilə baxmasının əsas səbəbi Bahadır idi.* S.Rəhman.

3. Bir hərəkətin və s.-nin düzgünlüyünü, gerçəkliyini izah edən, əsaslandıran, ona haqq qazandıran, ağlabatan ciddi səbəb, bəhanə, dəlil, sübut. *Qorxmağa əsası var. Əsas yoxdur. Hansı əsasla?* // İstinad nöqtəsi.

4. Adətən cəm şəklində: **əsaslar** – hər hansı bir elmin başlıca müddəaları, prinsipləri, elementləri. *Kimyanın əsasları. Nəzəri mexanikanın əsasları.* – *İlk həndəsənin əsasları ilə oxucu orta məktəbdə tanış olmuşdur.* Z.Xəlilov.

5. *qram.* Sözün, sözdəyişdirici şəkilçidən qabaq gələn başlıca (sadə, düzəltmə və ya mürəkkəb) hissəsi.

6. *kim.* Turşularla birləşəndə duz əmələ gətirən kimyəvi birləşmə. *Qələvi əsaslar.*

7. *riyaz.* Həndəsi fiqurun hündürlüyünə perpendikulyar olan tərəfi. *Üçbucağın əsası.*

◊ **Əsas etibarilə** – əsasən, başlıca olaraq, ümumiyyətlə. *C.Məmmədquluzadənin "Şərqi-Rus"dakı fəaliyyəti əsas etibarilə ədəbi xarakter daşımışdır.* M.İbrahimov. **Əsas götürmək (almaq, tutmaq)** – bir əsas kimi qəbul etmək, əsaslanmaq. *Siz mənim xahişimi əsas ala bilərsiniz.* Mir Cəlal. **Əsas kapital** *iqt.* – kapitalın istehsal vasitələrinə sərf edilən hissəsi. **Əsas qanun** – konstitusiya. **Əsası qoyulmaq** – 1) təsis edilmək, bünövrəsi, təməli, özülü qoyulmaq; 2) başlanmaq. **Əsasına qədər** – tamamilə, bütünlükdə, büsbütün, kökündən. **Əsasını qoymaq** – 1) bünövrəsini, özülünü, təməlini qoymaq; 2) təsis etmək. **...əsasında durmaq, ...əsasını təşkil etmək** – bir şeyin mənbəyi, onun əmələ gəlməsinin başlıca səbəbi olmaq.

**ƏSASƏN** [*ər.*] 1. *zərf* Əsli, kökü etibarilə, əsas etibarilə, ümumi cəhətdən. *Fikir əsasən doğrudur. Əsasən onunla razılaşmaq olar.* – *Maarif sahəsində mübarizə əsasən tədris ocaqlarına münasibətdə meydana çıxırdı.* A.Şaiq. *Çayqırağı məhəlləsində əsasən qəsəbənin yoxsulları .. yaşayırdılar.* Ə.Əbülhəsən. // Həqiqəti etibarilə, gerçəklik nöqteyi-nəzərindən. *Hadisə əsasən belə olmamışdır.*

2. *Qoş. mənasında.* Görə, əsaslanılaraq. *Onun fikrinə əsasən. Xahişinizə əsasən. Təxminlərə, fərziyyəyə əsasən hökm vermək olmaz. Ərizəyə əsasən qərar çıxarılmışdı.*

**ƏSASİ** *sif.* [*ər.*] *köhn.* b a x **əsas** 2-ci mənada. *Əsasi cəhətlər.* – *Həyat əsasi bir dəyişikliyə uğrayınca ədəbiyyat büsbütün başını itirdi.* C.Cabbarlı.

**ƏSASLANDIRILMA** "Əsaslandırılmaq"-dan *f.is.*

**ƏSASLANDIRILMAQ** *məch.* 1. Təməli atılmaq, möhkəm təməl üzərində qurulmaq.

2. İnandırıcı sübutlarla və ciddi dəlillərlə möhkəmləndirilmək. *İrəli sürülən fikirlər möhkəm dəlillərlə əsaslandırılmışdır.*

**ƏSASLANDIRMA** "Əsaslandırmaq"dan *f.is.*

**ƏSASLANDIRMAQ** *f.* 1. Təməlini atmaq, bünövrəsini (özülünü) qoymaq, möhkəm təməl üzərində qurmaq.

2. İnandırıcı sübutlarla və ciddi dəlillərlə möhkəmləndirmək, təsdiqləndirmək, inandırıcı sübutlar, dəlillər göstərmək (gətirmək). *Müddəalarını nəzəri dəlillərlə əsaslandırmaq. Öz görüşlərini əsaslandırmaq.* – *..Dikbığ Dadaş Lələşov öz sözünü əsaslandırmağa çalışdı.* S.Rəhimov. [Cuma] *lazım gələrsə, qatardan qalmasını əsaslandırmağa inandırıcı bəhanə də hazırlamışdı.* Ə.Əbülhəsən.

**ƏSASLANMA** "Əsaslanmaq"dan *f.is.*

**ƏSASLANMAQ** *f.* 1. Bir təmələ söykənmək, bir əsasa istinad etmək.

2. Özü üçün əsas götürmək, istinad etmək. *Ciddi dəlillərə əsaslanmaq. Belə bir qənaətə gəlməkdə nəyə əsaslanmısınız? Qanunlara əsaslanmaq.*

3. Kök salmaq, yerini möhkəmlətmək.

**ƏSASLI** *sif.* 1. Əsası, bünövrəsi, təməli, özülü olan; köklü, möhkəm.

2. Kifayət dərəcədə əsası olan, ciddi, tutarlı, inandırıcı, lazımınca əsaslandırılmış. *Əsaslı səbəb. Əsaslı sübut. Əsaslı təklif. – Belə mühüm bir məsələni Telli kimi avam bir qadına qandırmaq üçün əsaslı dəlillər və sübutlar lazım gələcəkdir.* S.Hüseyn.

3. Doğru, gerçək, həqiqi; əsli, əsası olan. *Əsaslı hadisələr. Əsaslı şayiələr.*

4. Dərin, ciddi, çox mühüm, prinsipial. *Əsaslı fikir ayrılıqları. Aralarında əsaslı ixtilaf vardır. Əsaslı məsələ.* ☐ **Əsaslı surətdə** – kökündən, ciddi surətdə, prinsipial. *Fikirlər əsaslı surətdə ayrılır. – ..Göndərilən təftiş komissiyası aylarla oturar, .. bu dairə ittifaqın işini əsaslı surətdə yoxlardı.* S.Rəhimov.

5. Hərtərəfli, incədən-incəyə. *Baxış bəygildə ildə iki dəfə ev tökülür, əsaslı yır-yığış olur.* Ə.Abasov.

◊ **Əsaslı kapital qoyuluşu** *iqt.* – əsaslı (ən mühüm) inşaat üçün buraxılan vəsait (pul). **Əsaslı təmir** – binanın (qurğunun, maşının) əsas hissələrinin tam təmiri. *Kabinet çox səliqəli, təmiz, əsaslı təmirdən çıxmış bir otaqdı.* Ə.Vəliyev. **Əsaslı tikinti** – xalq təsərrüfatının əsas fondlarının genişlənməsini təmin edən sənaye müəssisələri və mənzil inşaatı.

**ƏSASLICA** *zərf* Əsaslı surətdə.

**ƏSASLILIQ** *is.* 1. Əsaslı şeyin halı.

2. Ciddilik, tutarlılıq, inandırıcılıq. *Sübutların əsaslılığı. Təklifin əsaslılığı. Dəlillərin əsaslılığına şübhə ola bilməz.*

**ƏSASNAMƏ** *is.* [*ər.* əsas və *fars.* ...namə] Qanun, qayda, nizamnamə. *Seçkilər haqqında əsasnamə.*

**ƏSASSIZ** *sif.* 1. Bünövrəsiz, təməlsiz.

2. Heç bir sübuta, dəlilə, həqiqətə istinad etməyən, əsilsiz; inandırıcı olmayan, yalan, tutarsız. *Əsassız ittiham. Əsassız şübhə. Əsassız nəticə. – Onun verdiyi xəbərlərin bir çoxu əsassız xəbərlər idi.* M.S.Ordubadi.

**ƏSASSIZLIQ** *is.* 1. Bünövrəsizlik, təməlsizlik.

2. Heç bir sübuta, dəlilə, gerçəkliyə istinad etməmə; əsilsizlik, həqiqətdən məhrumluq, tutarsızlıq. *Şayiənin əsassızlığı. Çıxarılan nəticənin əsassızlığı. İrəli sürülən təqsirin əsassızlığı.*

**ƏSATİR** *is.* [*ər.* əsli *yun.*] Allahlar, əfsanəvi qəhrəmanlar və Yer üzündə insanların əmələ gəlməsi haqqında qədim xalq nağıl və əfsanələri; mifologiya. *Zərdüşt haqqında əsatir. Yunan əsatiri. İran əsatiri. – Xalqın həqiqi tarixi, əfsanələr və əsatirlərin dumanları içərisində itib getmiş, hər şey şübhələrin paltarına bürünmüşdür.* M.S.Ordubadi. *Mən uymadım əsatirlər xülyasına; Səcdə qıldım insanlığın mənasına.* S.Vurğun.

**ƏSATİRİ** *sif.* [*ər.*] Əsatirə aid olan, əsatir qəbilindən olan; əfsanəvi, mifoloji.

**ƏSBAB** *is.* [*ər.* “səbəb” söz. cəmi] *köhn.* 1. Səbəblər, dəlillər; səbəb, dəlil.

2. Silah, yaraq. [Zalxa Tarverdiyə:] *Əlbəttə, sənin də yaraq, əsbabın olacaq.* M.F.Axundzadə. // Alət, hacət, avadanlıq, ləvazimat.

**ƏSBABLI** *sif.* Silahlı, yaraqlı, silahlanmış. [Tarverdi:] *Görəsən, sövdəgər tayfası yaraqlı, əsbablı yola çıxar, ya elə bomboş?* M.F.Axundzadə.

**ƏSBƏ** *is.* Qızdırma ilə başlayıb, səpgiyə çevrilən bir xəstəlik. *Əsbə xəstəliyi ən çox uşaqlarda olur. Əsbə çıxarmaq.*

**ƏSBƏGÜLÜ, ƏSBƏÇİÇƏYİ** *is.* Tarlalarda, çöllərdə bitən bənövşə rəngli bir çiçək. *Xalq təbabətində əsbəgülünü əsbə azarının müalicəsində işlədirlər.*

**ƏSDƏMİ** b a x **ərsin.**

**ƏSDİRİLMƏ** “Əsdirilmək”dən *f.is.*

**ƏSDİRİLMƏK** “Əsdirmək”dən *məch.*

**ƏSDİRMƏ** “Əsdirmək”dən *f.is.*

**ƏSDİRMƏK** 1. *icb.* Əsməyə, titrəməyə məcbur etmək; əsməsinə, titrəməsinə səbəb olmaq; titrətmək, silkələndirmək. *Külək yarpaqları əsdirdi. – Zərrintac xanım şəhadət barmağını qaldırıb ilan başı kimi əsdirdi.* S.Rəhimov.

2. *t-siz. dan.* Veyil-veyil gəzmək, avaralanmaq.

◊ **Özünü əsdirmək** – özündən çıxmaq, əbəs yerə hirslənmək, çığır-bağır salmaq. *Nə özünü əsdirirsən?*

**ƏSƏB** *is.* [*ər.*] *anat. fiziol.* 1. İnsan, ya heyvan orqanizmində təxərrüşləri periferiyadan beyinə, yaxud beyindən periferiyaya ötürən xüsusi incə tellərdən ibarət törəmə sistemi; sinir. *Eşitmə əsəbi. Dişin əsəbini*

*öldürmək. Görmə əsəbi. İynə əsəbə toxunmuşdur. – Əsəb və yorğunluq onu elə haldan salmışdı ki, katilin üstündə otura bilmədi.* S.Rəhman.

2. Cəm şəklində: **əsəblər** – insanın hal və hərəkətini müəyyən edən həmin törəmələrin bir sistem kimi rolu. *Əsəbləri möhkəmdir. Əsəbləri pozulmaq. Əsəbləri gərginləşdirmək. – Kağızı oxudu və bütün əsəbləri gərildi.* H.Nəzərli. *Çöl havasının təsiri ilə getdikcə acığı soyuyur, əsəbləri rahat olurdu.* M.İbrahimov. *Elə bil birisi əsəblərimin saplarını bir-birinə qarışdıraraq düyün salmışdı.* Ə.Məmmədxanlı.

◊ **Əsəblərinə təsir etmək (toxunmaq)** – hirsləndirmək, əsəbiləşdirmək. *Lakin Toğruldan bir xəbər olmaması onun əsəblərinə toxunmuşdu.* M.S.Ordubadi. *İçərişəhərin damları üstündə yatanlardan bəzisi xoruldadıqca Turabın əsəblərinə toxunurdu.* M.Hüseyn. **Əsəbləri ilə oynamaq** – bax **əsəblərinə təsir etmək (toxunmaq)**.

**ƏSƏBANİ** *zərf* [*ər.* əsəb və *fars.* ...ani] bax **əsəbi**. [Şeyx Yəhya:] *Ağacan, nə üçün əsəbani olursan, bu nə işdir?* S.Hüseyn.

**ƏSƏBİ** *sif.* [*ər.*] 1. Sinirləri son dərəcə həssas olduğu üçün cüzi bir şeydən çox tez əsəbiləşən, təsirlənən, hirslənən. *Əsəbi adam. Əsəbi qadın. Qırmızı işıqda uzun müddət işləyən adamlar get-gedə əsəbi olurlar. – Mollayev qaraqabaq, zəhmli və əsəbi bir adamdı.* M.Hüseyn. // Əsəb xəstəliyi olan. *Əsəbi xəstə.*

2. Daxili həyəcan və iztirab ifadə edən, əsəbilik ifadə edən. *Əsəbi yeriş. Əsəbi hərəkətlər. Əsəbi gülüş. Əsəbi göz yaşları. – Ayaz .. əsəbi bir hərəkətlə papirosunu yerə çırpdı.* Ə.Məmmədxanlı. *Gecənin sükutunda kağız üzərində əsəbi hərəkətlə gəzən qələmin xəfif səsi eşidilirdi.* Mir Cəlal.

3. Əsəbiləşdirici, əsəbiləşməyə, həyəcanlanmağa səbəb olan; narahatlıq və iztirabla dolu. *Əsəbi iş. Əsəbi dövr. – Keçmiş .. o ölüm hissi verən kinli zamanlar; Xırçın, əsəbi, sisli xəzanlarla süründü.* A.Şaiq.

**ƏSƏBİCƏSİNƏ** *zərf* Əsəbi halda, əsəbi adam kimi. *Əsəbicəsinə qollarını oynatmaq. – Sənəm xala ahəngini dəyişdirir və bir az da əsəbicəsinə danışır.* Mir Cəlal.

**ƏSƏBİLƏŞDİRİCİ** *sif.* Əsəblərə pis təsir edən, əsəbləri qıcıqlandıran, əsəbiləşdirən, sinirləndirici. *Əsəbiləşdirici təsir.*

**ƏSƏBİLƏŞDİRİCİLİK** *is.* Əsəbiləşdirici şeyin hal və keyfiyyəti.

**ƏSƏBİLƏŞDİRİLMƏ** "Əsəbiləşdirilmək"dən *f.is.*

**ƏSƏBİLƏŞDİRİLMƏK** *məch.* Əsəbləri qıcıqlandırılmaq, əsəbi hala salınmaq; sinirləndirilmək, hirsləndirilmək.

**ƏSƏBİLƏŞDİRMƏ** "Əsəbiləşdirmək"dən *f.is.*

**ƏSƏBİLƏŞDİRMƏK** *f.* Əsəblərini qıcıqlandırmaq, əsəblərinə toxunmaq, əsəbi hala gətirmək; sinirləndirmək, hirsləndirmək. *Maşınların səsi adamı əsəbiləşdirir. Onun hərəkəti bizi əsəbiləşdirdi. –* [Zeynal] *bilirdi ki, Mehribanı təqib edəcək olsa, onu daha da əsəbiləşdirər.* S.Hüseyn. *Onun bir yerdə .. durması Atabəy Məhəmmədi həddindən artıq əsəbiləşdirdi.* M.S.Ordubadi. *Həkim ağır addımları ilə Ramazanı əsəbiləşdirdi.* Mir Cəlal.

**ƏSƏBİLƏŞMƏ** "Əsəbiləşmək"dən *f.is.*

**ƏSƏBİLƏŞMƏK** *f.* Əsəbləri qıcıqlanmaq, əsəbilik halına gəlmək, əsəblərə təsir edən bir şey nəticəsində həyəcanlanmaq, darıxmaq, ya hirslənmək; sinirlənmək. *Adam hər şeydən ötrü əsəbiləşməz. Əsəbiləşmək cana zərərdir. – Şəngül bəzi vaxt, ələlxüsus Tağı əmi gecikdikdə əsəbiləşərək ovu iznsiz qaldırardı.* S.S.Axundov. *Zeynal üçüncü kərə ona faytona oturmağı təklif etdikdə Mehriban əsəbiləşdi.* S.Hüseyn. *Eldar bu hərəkətimdən, mənim əsəbiləşdiyimi başa düşdü.* M.Rzaquluzadə.

**ƏSƏBİLİK** *is.* Əsəbi olma, əsəbi adamın halı; əsəblərin hər bir şeydən təsirlənməsi, qıcıqlanması; sinirlilik. *Həddindən artıq əsəbilik. – İndi Toğrulun qəvi əzələləri təpədən dırnağa kimi qorxunc bir əsəbilik ilə titrəyirdi.* H.Nəzərli. *Səlimin əsəbiliyi artır, narahatçılığı çoxalırdı.* S.Rəhimov.

**ƏSƏBİMƏZAC** *sif.* [*ər.*] *köhn.* Əsəbi xasiyyətli. *Əsəbiməzac adam. –* [Səfi bəy:] *Dayıqızı doğru deyir, sən əsəbiməzacsan.* S.S.Axundov.

**ƏSƏBİMƏZACLIQ** *is.* Əsəbiməzac adamın hal və keyfiyyəti; əsəbilik.

**ƏSƏBİYYƏT** *is.* [*ər.*] b a x **əsəbilik**. *Çarpışmaq üçün lazım ikən mərdə cəsarət; Bilməm, neçin olmuş sana qalib əsəbiyyət?* H.Cavid.

**ƏSƏL** *is.* [*ər.*] *klas.* Bal. *Baqqal .. əsəl qiymətinə satar ayranı.* Q.Zakir.

**ƏSƏN** *sif. qəd.* Sağ, salamat. *Verdi xələt çün anı gördi əsən*. Yusif Məddah.

**ƏSƏR** *is.* [*ər.*] 1. İz, nişanə, əlamət, bir şeyin varlığına dəlalət edən hal. *Əsər qalmamaq. Yorğunluqdan əsər yox idi. Üzündə həya əsəri yoxdur. – Cırıldayan arabanın çərxləri; Qazmış yolu, yerdə qalmış əsəri.* A.Səhhət. *Könlündə qalmadı insaf əsəri; Dürdanənin qəlbi sal buza döndü.* M.Rahim.

2. İnsan əməyi, insan yaradıcılığı, icadi məhsulu. *İncəsənət əsərləri. Heykəltəraşlıq əsərləri. Memarlıq əsərləri. İxtiraçıların əsərləri. Musiqi əsərləri.* // Yazılı əmək məhsulu; ədəbi, elmi kitab, məqalə və s. *Bədii əsər. Füzulinin əsərləri. Kimyaya dair əsər. Əsərlər külliyyatı. Elmi əsərlərin nəşri. – Buna görə də sizin mənə tövsiyə etdiyiniz "Məmunun xülasələri" adlı əsəri açıb məşğul oldum.* M.S.Ordubadi.

3. Təsir. *Bu hadisənin ona heç bir əsəri olmadı. – Bunlar hamısı qohumluğun əsərləridir!* C.Məmmədquluzadə. ◻ **Əsər eləmək (etmək)** – təsir etmək. *Nə üçün söz sənə əsər eləmir. – Ol səngdilə naleyi-zarım əsər etmiş.* Füzuli. *Sənin də başında məhəbbət beyni; Əgər olsa, eylər əsər, ağlarsan.* M.V.Vidadi. *Sözün ona etməz əsər; Aralıqda başın gedər.* A.Şaiq.

4. B a x **asar**.

5. Yadigar mənasında. *Yaxşı övlad ata-ana üçün ən əziz bir əsərdir.*

◊ **Əsəri gəlmək** *dan.* – isitmə dayanandan sonra, yüngülcə və az zaman titrəmək. *Əsəri gəlmiş, indi ötəcək.*

**ƏSƏRBƏXŞ** *sif.* [*ər.* əsər və *fars.* ...bəxş] *köhn.* Təsirli, təsir edən, təsir bağışlayan.

**ƏSƏR-ƏLAMƏT** b a x **əsər** 1-ci mənada. ◻ **Əsər-əlamət qalmamaq** – heç bir izi, təsiri qalmamaq. *Gündüzkü buluddan, çiskindən heç bir əsər-əlamət qalmayıb.* R.Rza. *Nə keşikçilərdən, nə qapıçılardan, nə də sair xidmətkarlardan əsər-əlamət yox idi.* M.Rzaquluzadə.

**ƏSƏRLƏNMƏK** *f. dan.* 1. Səndələmək, yıxılan kimi olmaq, titrəmək (yuxusu gələndə, üşüyəndə).

2. Təsirlənmək.

**ƏSƏRLİ** *sif.* Təsirli, təsir edən, təsiri olan, təsir bağışlayan; iz buraxan.

**ƏSƏRSİZ** *sif.* 1. Təsirsiz, heç bir təsiri olmayan, təsir etməyən, heç bir iz buraxmayan.

2. Heç bir icad və yaradıcılıq məhsulu olmayan, heç bir əsəri olmayan. *Əsərsiz yazıçı olmaz. – Arxayın-arxayın gəzmə əsərsiz* (z.); *Deməsinlər halı pərişan gedir.* M.Rahim.

**ƏSGƏR** *is.* [*ər.*] 1. Sıravi hərbi qulluqçu; soldat. *Milli ordunun əsgəri. Bir bölük əsgər. Əsgər və matroslar. – Komandan əsgərlərdən geri qalmamaq üçün yoluna davam edir.* M.Hüseyn. *Hələ əmr alıb işə başlamazdan əvvəl əsgər soyuqdan bir-birinə sıxılır.* Ə.Əbülhəsən. ◻ **Əsgər aparmaq** – hərbi qulluğa çağırmaq. *Onu əsgər apardılar. – Vətən müharibəsinin lap əvvəlinci günlərində Dilbərin atası Qulaməlini əsgər apardılar.* Ə.Sadıq. **Əsgər düşmək** *köhn.* – b a x **əsgər getmək. Əsgər getmək** – hərbi qulluğa götürülmək. *Onun yaşı çatdı, əsgər getdi. – El məscidə yığılmışdı. Əsgər getmə məsələsinə baxırdılar.* Mir Cəlal. **Əsgər yığmaq** – əsgərlik vaxtı çatanları və əsgərliyə lazım olanları hərbi qulluğa toplamaq, səfərbərliyə almaq. **Əsgərə götürülmək –** b a x **əsgər getmək.**

2. Silahlı adamlar dəstəsi; qoşun. [Koroğlu:] *Çay kimi coşmuşam, daha sönmərəm; Əsgər nədi, qoşun nədi, qanmaram.* "Koroğlu".

3. Hərbi adam, hərbi xidmətdə olan adam, ümumiyyətlə, hərbi xidmətçi. *O, əsgər adamdır. Bir əsgər kimi hərəkət etmək. Bütün əsgərlərə müraciət.* ◻ **Əsgər paltarı** – hərbi geyim. [Səfərəli:] *Hamı o biri otağa əsgər paltarı geyməyə marş!* H.Nəzərli. *Geyib əsgər paltarını, silahlandı qəhrəman; Onun polad sinəsinə sığışmadı ürəyi..* S.Vurğun.

**ƏSGƏRCƏSİNƏ** b a x **əsgərvari**. *Bülənd əsgərcəsinə əlini yanına salmış, uzun boynunu dala qanırmışdı*. Ə.Əbülhəsən.

**ƏSGƏRİ**[1] *sif.* [*ər.*] Əsgərə, əsgərliyə, hərbi xidmətə, qoşuna aid; hərbi. *Əsgəri*

*forma. Əsgəri qarovul. Əsgəri xidmət. – Əsgəri andın saf və səmimi sözləri döyüşçülərin qəlbində düşmənə qarşı olan qığılcımı alova çevirdi.* Ə.Vəliyev. *Birdən aşağıdakı əsgəri düşərgə yanındakı düzənlikdən bir gurultu ucaldı.* M.Rzaquluzadə.

**ƏSGƏRİ²** *is.* Üzüm növlərindən birinin adı. *Baba isə xatını, .. əsgəri, mövücü üzümləri dərib gətirər, tapdalayar və şirə yığardı.* H.Sarabski.

**ƏSGƏRLİK** *is.* Hərbi qulluq, hərbi xidmət, hərbi mükəlləfiyyət. *Əsgərlik adamı intizama öyrəşdirir. Əsgərlik illəri. Əsgərlikdən qayıtmaq. – Ax, əsgərliyə o qədər həvəsim var ki?* H.Nəzərli. [Xanmurad:] *Əsgərliyə gedən kimi arvadını boşayıb qıza elçi göndərdik.* İ.Əfəndiyev. *Əsgərliyə gəldiyi gün qucağında körpə Aslan, boynunu bükərək onun dalınca su atan Zəhra Cavadın yadından heç çıxmırdı.* Ə.Vəliyev.

**ƏSGƏRSAYAĞI** *zərf* Əsgər kimi, əsgərvari. [Şahmar:] *Buyur, nə sərəncamın varsa, deyinən, bir dəqiqənin içində lap əsgərsayağı yerinə yetirim.* M.Hüseyn.

**ƏSGƏRVARİ** *sif.* Əsgər kimi, özünü əsgərə oxşadaraq. *..Bayram əsgərvari, qollarını sallayaraq ayaqlarını yerə vura-vura .. sol tərəfdəki qapıdan içəri girər.* H.Cavid.

**ƏSGİ** *is.* 1. Körpə uşaqları bələmək üçün parça.

2. Köhnə paltar və s. parçaları. *Əsgi ilə döşəməni silmək. –* [Dərviş] *biletini bir əsgiyə büküb yenə cibinə tulladı.* A.Divanbəyoğlu. *..Onun içərisindən əsgiyə bükülmüş bir şey götürdü.* H.Nəzərli. *Tüfəng yağlı bir əsgiyə sarılıb küncdə qoyulmuşdu.* M.Rzaquluzadə.

**ƏSGİÇİ** *is.* 1. Əsgi paltar, ev əşyası və s. yığıb (alıb) satan adam.

2. Bax **əntiqəçi**.

**ƏSGİLƏŞMƏ** "Əsgiləşmək"dən *f.is.*

**ƏSGİLƏŞMƏK** *f.* Köhnəlmək (paltar haqqında), əsgiyə dönmək.

**ƏSGİLİK** *is.* Köhnəlik (paltar haqqında).

**ƏSGİNAS** [*fr.* "assignation"-dan] *köhn.* Kağız pul. *Bir cibimdə əsginasım, bir cibimdə ağ manat; Olsun, olsun, qoy çox olsun böylə ləzzətli həyat.* M.Ə.Sabir. [Salamov:] *Ala, hələlik bu əsginası verim, .. çıxanda yenə verərəm.* C.Cabbarlı. *Bir qədər gənclərlə oynadıqdan sonra əliaçıq tamaşaçılar* [Altıaylığa] *üçlük, beşlik, onluq əsginas bağışlardılar.* H.Sarabski.

**ƏSGİ-PÜSGÜ, ƏSGİ-ÜSGÜ** *is.* Köhnə, cındır parça(lar). [Hacı Murad:] *Di gəl bax, gör burada əsgi-üsgüdən başqa nə var?* S.S.Axundov. [Firidun bəy:] *Əlacım kəsildi, getdim, oradan bir neçə əsgi-üsgüdən alıb məni yüklədi.* Ə.Haqverdiyev. [Ələmdar] .. *gizlətdiyi qızıl dür-düyünçələrini dartışdırıb dəyirmi stolun üstünə tökdü, əsgi-üsgüdən azad etdi.* S.Rəhimov.

**ƏSHAB** *is.* [*ər.*] *köhn.* 1. Sahibkar.

2. Tərəfdarlıq.

3. Həmsöhbətlər, müsahiblər.

**ƏSHABƏ** *is.* [*ər.* "sahib" söz. cəmi] 1. *din.* Məhəmməd peyğəmbərin və imamların yaxın adamları.

2. *zar.* Tərəfdar, daim birinin yanında olan adam, yoldaş. *Bütün bunları Həmzə danışmaqdan, əshabələri isə dinləməkdən yorulmurdu.* Ə.Əbülhəsən.

**ƏSİL** *is.* [*ər.*] 1. Əsas, təməl, özül, bünövrə. *Əsli çürükdür.* // Mahiyyət, kök. *İşin əsli budur.*

2. *sif.* Əsilli, nəcabətli, əsil-nəcabət sahibi, nəcib. *Əsil adam. – Əsil al, çirkin olsun; Bədəsil gözəl alma.* (Ata. sözü). *Övlad nəcib, əsil* (z.) *çıxsa; Xoşbəxt olar həm atalar.* N.Rəfibəyli.

3. Mənbə, çıxış, başlanğıc. *Bu işin əsli 20 il qabaqdan hesab edilməlidir // məc.* Həqiqət, gerçəklik, doğruluq. *Bu xəbərin əsli yoxdur. –* [Müəllim:] *Sizin barənizdə yeni bir söz eşitmişəm. Amma bilmirəm, əsli var, ya yox.* Ə.Vəliyev.

4. Surət, yaxud tərcümə olmayan, ilk halında olan yazı; orijinal. *Surəti əslinə uyğundur. Məqalənin əsli. Məktubun əsli.* // Sif. mənasında. *Əsil məktubu isə yenə də Toğrula göndərmək lazımdır.* M.S.Ordubadi.

5. *sif.* Həqiqi, doğru, düzgün. *Əsil adın nədir? Əsil gözəl buna deyərlər. Əsil mərəkə başlandı.* ☐ **Əslinə baxsan (baxdıqda, qalanda)** – əslində, həqiqətdə, həqiqətə gəldikdə. *Əslinə baxsan, günah ondadır.* // Həqiqətən, nə cür lazımsa, o cür, bir şeyin ən yaxşı nümunəsini, idealını təmsil

edən, həqiqi. *Əsil sənətkar. Əsil insan. Əsil şair.* – [Nadir bəy:] *Lakin yenə təkrar edirəm, məncə; Əsil qəhrəmanlıq yara bağlamaqdadır, abad etməkdədir.* H.Cavid. // Başlıca, əsas, ən mühüm. *Əsil məsələ budur. Əsil mətləbə keç. Onun əsil sənəti müəllimlikdir. – Tahir nə qədər fikirləşirdisə də, əsil mətləbini demək üçün münasib bir ifadə tapa bilmirdi.* M.Hüseyn. // Həqiqətən, gerçəkdən. *Əsil iş görən kənarda qalıb.*

6. Nəsil, soy, nəsəb, mənşə. *Əslin qarabağlıdır; Sinəm çarpaz dağlıdır; Nə gedən var, nə gələn; Deyən, yollar bağlıdır?* (Bayatı). *Mən də öyrəndim ki,* [qızın] *əsli mərdəkanlıdır.* S.Hüseyn. *Bir gün dedim*: – *Gözəlim; Sənin əslin haralı?* Ə.Cavad.

7. *sif.* Ən birinci, ən köhnə, ilk. *Onun əsil vətəni Qarabağdır. Əsil yurduna dönmək.*

8. *sif.* Xalis, saf, təmiz, qatışıqsız. *Əsil kərə. Əsil motal pendiri. Əsil qızıl. Əsil şal parça. – Xonçada olar .. üç pud qənd, bir pud şirni və bir ədəd əsil tirmə şal.* R.Əfəndiyev.

9. Məhz, həmin, lap. [Qasım:] *Əsil bu paltarda oynamaq lazımdır.* S.Rəhman.

10. **Əslində** şəklində – 1) kökündə, bünövrəsində; 2) ibtidada, başlanğıcda, lap əvvəlində. *Əslində o, dərzi olmuşdur. Əslində o, xanəndə idi;* 3) həqiqətdə, əslinə baxılarsa. *Əslində o da bu fikirdə idi. – Əslində anası onlara çox az-az görünər.* S.Rüstəm. *Əslində isə rəisin hirsi soyumadı.* Mir Cəlal.

**ƏSİLLƏNMƏK** b a x **əsilləşmək**.

**ƏSİLLƏŞMƏ** "Əsilləşmək"dən *f.is.*

**ƏSİLLƏŞMƏK** *f. dan.* 1. Yurd-yuva salmaq, yerləşmək, kökləşmək, yerli adət və ənənələri qəbul etmək. *Onlar başqa yerlərdən gəlib Azərbaycanda əsilləşmişlər.*

2. Xalisləşmək, saflaşmaq.

**ƏSİLLİ** *sif.* 1. Əsil-nəcəbi olan, nəcabətli, əsil. *Əsilli adam. – Xotkar qızı, şah nəsilli; Ağır elli, xan əsilli.* "Koroğlu".

2. Əsli olan, saxta olmayan, inanılacaq, doğru, gerçək.

**ƏSİL(Lİ)LİK** *is.* 1. Xalislik, saflıq. *Bu qızılın əsilliyi məhəkdə məlum oldu.*

2. Təmizlik, nəciblik, alicənablıq, comərdlik.

**ƏSİL-NƏSƏB** b a x **əsil** 5-ci mənada. *Bir gün bazar tacirlərinin birisi Mahmudun gözünə çox şirin gəldi. Mahmud bu tacirnən yaxın olub, onun əsil-nəsəbini öyrənəndən sonra, həmin tacir İlyası çəkdi dükanına.* (Nağıl). *Pinəçi .. evində əsil-nəsəbi məlum olmayan adamları saxlaya bilməyəcəyini bildirdi və ev kirayəsi tələb etdi.* M.İbrahimov. [Şeyx Amiri:] *Sən ki əsil-nəsəbimə yaxşı bələdsən, sərvətimdən, xəzinəmdən də xəbərin var.* Ə.Məmmədxanlı.

**ƏSİLSİZ** *sif.* 1. Əsli, əsası olmayan; doğru, gerçək olmayan; yalan, uydurma. *Əsilsiz xəbər. Əsilsiz şayiələr. – Əsilsiz söz sahibinə üz qarası gətirər.* (Ata. sözü). // Heç bir şeylə əsaslandırılmayan. *Əsilsiz tələb. Əsilsiz iddialar. – ..Biz onun verdiyi xəbərləri bir də Mirzə Ələkbər xan vasitəsilə yoxlayır və əsilsiz olduğunu təyin edirdik.* M.S.Ordubadi.

2. Əsli, nəcabəti olmayan.

**ƏSİLSİZLİK** *is.* 1. Əsassızlıq, həqiqətdən uzaqlıq. *Xəbərin əsilsizliyi.*

2. Əsli-nəsəbi olmama, nanəciblik.

**ƏSİLZADƏ** *is.* [*ər.* əsil və *fars.* ...zadə] *köhn.* 1. Zadəgan, kübar (xan, bəy). *Bir adam ki .. Müqim bəy Cavanşir kimi bir əsilzadənin mühafizi ola, daha nə üçün vəziyyətindən razı olmasın?* S.Rəhimov.

2. Nəcib, nəcabətli, alicənab.

**ƏSİM-ƏSİM: əsim-əsim əsmək** – bərk titrəmək. *Əynində paltarı əsim-əsim əsir. Hirsindən əsim-əsim əsmək.* – [Telli:] *Bədənim əsim-əsim əsir.. Heç əqlimə gəlməyən işə düşmüşəm.* N.Vəzirov. *Körpünün tiri o tərəf-bu tərəfdən görsənir. Hər dəfə yeni dalğalar ona toxunduqda əsim-əsim əsirdi.* Ə.Vəliyev. *Əsim-əsim əsirdi. Katibə tapşırdı ki, Vahidin dediyini bir yerə yazıb saxlasın.* Mir Cəlal.

**ƏSİR** *is.* [*ər.*] 1. Müharibədə ələ keçirilən düşmən əsgəri, zabiti və s. *Hərbi əsir. Əsir düşmək. Əsir olmaq. Əsir tutmaq. Əsirlərin azad edilməsi. Hərbi əsirlər vətənlərinə döndülər.* – [Səlim bəy:] *Bax, yenə əlimdə əsirsən, əsir; Duyuram, qorxudan ürəyin əsir.* S.Rüstəm.

2. Kölə, qul, məhkum. *Dedim*: *– Ey gül, niyə etdin məni zülfündə əsir? Dedi*: *– Divanə olan şəxsə gərəkdir zəncir.* S.Ə.Şirvani. *Özünü insan əlində əsir görən kəklik qurtul-*

*maq üçün .. əllərimizi dimdikləyirdi.* A.Şaiq. *Ey dilsiz gözlərin qara röyası; Ardınca qarğadı qullar, əsirlər.* S.Vurğun.

3. *məc.* Dustaq, azadlıqdan, sərbəstlikdən məhrum edilmiş. ☐ **Əsir olmaq** – 1) azadlıqdan məhrum olmaq; 2) tamamilə tabe olmaq. *Qız qayın-qudanın, qayınatanın, baldızın, qayınananın hökmünə əsir olar, onların dedi-qodusuna düşərdi.* H.Sarabski.

4. *məc.* Vurğun, məftun, mübtəla. *Eşq əsiri. Gözəllik əsiri. – Görməmişəm belə zülfü dəhəntək; Yüz min əsiri var, əlbəttə, mən tək.* Aşıq Məhəmməd. *Bir ahu baxışlı gözələ çoxdan əsirəm; Ahimlə şikar olsan, mən neyləyə billəm.* Ə.Vahid. ☐ **...əsiri olmaq** – ...vurğunu olmaq, ...düşkünü olmaq, ...mübtəla olmaq. [Bəhram:] *Belə də insaf olar ki, biçarə Saranın illərlə divam edən məhəbbətin sındırıb da, əhdimi buraxıb da, bir başqasına əsir oldum?* C.Cabbarlı.

**ƏSİRGƏMƏ** "Əsirgəmək"dən *f.is.*

**ƏSİRGƏMƏK** *f.* 1. Rəhmi gəlib qorumaq, saxlamaq, hifz etmək, himayə etmək. [Səlim qızı:] *Ulu tanrım, sən bu yetim yavrucuğu əsirgə!..* C.Cabbarlı. [Orxan:] *İsmət! Allah əsirgəsin, nədir bu halət?* H.Cavid.

2. Qıymamaq, qıyıb verməmək, heyfi gəlmək, xəsislik etmək, qızırqamaq. *Şeylərini çox əsirgəyir. – Dağlar sənin ilə həmdəm olmaya; Əsirgərsən indi qarı da məndən.* Qurbani. [Xudayar bəy:] *Bax, ey qazı ağa, .. mən məlun adamam əgər başımı da sənin yolunda əsirgəyim.* C.Məmmədquluzadə. *Camaatdan ötrü, doğrudan, Qurbanqulu heç bir şeyin əsirgəmədiyi kimi, canından belə keçməyə hazır idi.* T.Ş.Simurq. // Qənaət etmək, qənaətlə işlətmək.

**ƏSİRGƏNMƏ** "Əsirgənmək"dən *f.is.*

**ƏSİRGƏNMƏK** *məch.* 1. Qorunmaq, saxlanmaq, himayə edilmək, hifz edilmək. *Pəriyəm, durmuşam mərdü mərdanə; Əsirgənmə bu meydandan, ey Qədir!* Aşıq Pəri.

2. Qıyılmamaq, qıyılıb verilməmək. *Əsirgənəcək şey deyil.* // Qənaət edilmək.

**ƏSİRLİK** *is.* 1. Əsir düşmüş adamın hal və vəziyyəti, bu vəziyyətdə keçirilən həyat. *Əsirlikdən qayıtmaq. Əsirlikdə olmaq. Əsirlik həyatı. –* [Şofer:] *Qardaşımdan əlimi üzmüşdüm. ..Sən demə, partizan olubmuş. Əsirlikdən qaçıb, düz iki il vuruşub..* M.Hüseyn. *..."Əsir" sözünün özü, "əsirlik" məfhumunun özü dəhşətlərin ən böyüyü idi.* Ə.Əbülhəsən.

2. Köləlik, qulluq, məhkumluq, dustaqlıq, əsarət. *Əsirlik həyatı. Əsirlikdən qurtarmaq. –* [Bədəl:] *Bircə qeydim bacımın əsirlikdən qurtarmasıdır.* Ə.Haqverdiyev. *O, heç bir vaxt əcnəbi himayəsində qazanılan istiqlalın əsirlikdən ibarət olduğunu anlamır.* M.S.Ordubadi. [Elxan:] *Lakin kim bilir, yazıq Solmaz indi əsirlikdə nələr çəkir.* C.Cabbarlı.

**ƏSİR-YESİR** *top. dan.* Yoxsul, hüquqsuz, yazıq, aciz, kimsəsiz adamlar. ☐ **Əsir-yesir eləmək** *dan.* – əsir etmək, məftun etmək. [Münəvvərin] *təsəllisi bircə bu idi ki, gözəl idi! Öz dediyi kimi, şəkli-şəmayılı ilə Hacını əvvəl gündən əsir-yesir eləmişdi.* Mir Cəlal.

**ƏSKEŞ** *is.* [*fars.*] *məh.* Arabanın at qoşulan iki uzun tirlərindən hər biri. *Arabanın əskeşi sınmışdır.*

**ƏSKİ**[1] *sif.* 1. Keçmiş, köhnə. *Əski adətlər. Əski qayda və ənənələr. Əski moda. Əski üsullarla işləmək olmaz. – Zeynal əski bir şkafı köndələn qoymaqla şüşəbəndi ikiyə bölmüş, açıq qalan yerinə də bir pərdə asmaqla Səlimi öz ailəsindən ayırmışdı.* S.Hüseyn. *Hər əski ənənə, hər əski adət; Məhəbbət, iztirab, gülüş, qiyafət: Məncə, bıqdırırdı bəşəri hər an.* S.Vurğun. // Köhnəlmiş, yıpranmış, xarab olmuş. *Əski şeylər. Əski paltar. Əski bir bina.*

2. Qədim, keçmiş dövrlərə aid. *Bu yerlərin əski əhalisi. Ölmüş əski dillər. Əski dinlərin qalıqları. Əski abidələr. – Bu əski əfsanə gülünc olsa da; Qalmış əsrlərcə qoca yadigar.* S.Vurğun.

3. Çoxdankı, köhnə. *Əski dost. –* [Nadir] *bir cəhətdən də* [Məcidin] *gəlməsinə və əski yoldaşı ilə görüşməyinə şad idi.* B.Talıblı. *Bu gün mən başqa bir dünyaya çıxdım; O əski, lap əski qərargahımdan.* S.Vurğun.

4. Təcrübəli, qocaman. *Əski müəllim. Əski usta. Əski həkim. –* [Möhsünzadə] *yenə Zeynalın vəziyyətinə girmək, ona bir az yardım etmək istəyirdi. Hər necə olsa o, əski bir işçi idi.* S.Hüseyn. // Yaşlı. *Əski adamdır, cavan görünməsinə baxma.*

◊ **Əski hamam, əski tas** – heç bir şey dəyişməyib, köhnə halında qalmışdır. *Əski hamamdır, əski tas, bəs yeni rənginiz hanı? Dinmə, danışma, yat, balam, sən deyən olmayıb hələ!* M.Ə.Sabir. [Surxay Aydına:] *Sənin isə düşündüyün fədəm-dəmə, istəklərin damdan-dama, etdiklərinə gəlincə, əski tas, əski hamam.* C.Cabbarlı. [Azər:] *Artdıqca bilgilər, artır ehtiras; Heç fərqi yox – əski hamam, əski tas.* H.Cavid. **Əski qapı, əski daban** – b a x **əski hamam, əski tas.** *Qəzetçi, molla yazığın ağzını lap ovuşdurub; İndi yazır əski qapı, əski dabanı birbəbir.* C.Cabbarlı.

**ƏSKİ²** b a x **əsgi.**

**ƏSKİK** *sif.* 1. Bütün olmayan, naqis, natamam, çatışmayan. *Üç manatdan otuz qəpik əskik. Parça 3 santimetr əskikdir.* □ **Əskik çəkmək** – düzgün çəkidən az çəkmək, çəkidə aldatmaq. *Əskik çəkən satıcı cəzalanar.* **Əskik çıxarmaq** – müəyyən olan miqdardan az hesab etmək. **Əskik çıxmaq** – müəyyən miqdardan, yaxud təxmin edildiyindən əskik olduğu meydana çıxmaq. **Əskik deyil** – daim vardır, həmişə mövcuddur. *Çünki tən durduqca məndən dərdü qəm əskik deyil.* Füzuli. *Gəhi hicrin, gəhi vəslin vurar od qəlbi-suzanə; Heç əskik deyil bu guşeyi-viranədən atəş.* S.Ə.Şirvani. **Əskik etmək (eləmək)** – 1) azaltmaq; 2) kəsmək, fasilə vermək, davam etdirməmək, arasını kəsmək. *Məktubunu əskik etmə.* **Əskik gəlmək** – b a x **əskik çıxmaq**. **Əskik olma, əskik olmayasan (olmayasınız** və s.**)** – sağlıq, salamatlıq arzusu bildirən ifadə. [Şeyx Sənan:] *Cümlə ikramü lütfünüz məlum; Sağ olun, əskik olmayın, oğlum!* H.Cavid. [Vidadi:] *Yaxşı, nə tapmısan o saraylarda? Sağ ol, əskik olma, sən yaşa barı.* S.Vurğun. [Kazım:] *Dostluqdan əskik olmayasınız.* Mir Cəlal. **Əskik olmamaq** – həmişə var olmaq, mövcud olmaq, daim olmaq. *Hindistanda Qanq çayı bizim Kür çayından çox böyükdür, .. amma bu çaydan vəba zəhəri heç əskik olmur..* C.Məmmədquluzadə. *Çeşmələr başından heç əskik olmaz; Zurna-balabanı bizim dağların.* S.Vurğun. **Əskiyini doldurmaq (tamamlamaq)** – çatışmayan cəhəti, hissəni əlavə edib tamamlamaq. **Başından əskik olmamaq** – b a x **əskik olmamaq**. **Heç əskik olmasın** – həmişə olsun, yox olmasın. *Köməyiniz heç əskik olmasın! – Vəsfini söylərəm həddən ziyadə; Heç əskik olmasın mülkü mal sənə.* Aşıq Pəri.

2. Nöqsanlı, qüsurlu, eyibli, çatmayan, yarımçıq. *Onun ağlı bir qədər əskikdir.* // Alçaq, pis, əskiklik gətirən. *Əskik söhbətlər. – Gül dilləndi: – Salmayın səs; Danışmayın əbəs-əbəs; Qəlbə dəymək əskik işdir.* M.Dilbazi.

3. Başqasından az, kiçik, alçaq, aşağı. *Sənin boyun onunkundan bir az əskikdir. Onun pulu mənimkindən əskikdir.* – [Mazandaranski:] *Əlbəttə, mən heç özümü səndən əskik adam bilmirəm.* C.Cabbarlı. *Xanın həyətində qaravaşlar, nökərlər çox idi. Hamısından kiçiyi və vəzifəcə əskiyi Budaq idi.* Ə.Vəliyev.

4. Qiymətsiz, dəyərsiz. *Demin əskik məni; tədric ilə yaqut olan daşlar; Boyandıqca ciyər qanilə qədrü qiymətim artar.* Füzuli.

5. *İs. mənasında.* Əskik gələn miqdar, çatışmayan miqdar, tam olmaq üçün əlavə edilməli olan miqdar. *Əskiyi doldurmaq. Əskiyi çoxdur. Onun da beş manat əskiyi var.* // Çatışmayan şey, gərəkliyi duyulan şey, əgər-əskik. *Evin əskiyi qurtarmır.*

**ƏSKİK-ARTIQ** *zərf* Lüzumsuz, artıq, yersiz, namünasib; ədəb, nəzakət həddini aşan. *Əskik-artıq danışmaq.*

**ƏSKİK-ƏSKİK** *zərf* Pis-pis, alçaq-alçaq, pis adamlar kimi. *Əskik-əskik danışmaq.* // *sif.* İnsanı alçaldan. *Əskik-əskik söhbətlər.*

**ƏSKİK-GƏRƏK** *is.* Qüsur, nöqsan, çatışmayan cəhət. *Düzəlib işlərin əskik-gərəyi; Millətin dərdinə dərman oldu.* M.Ə.Sabir.

**ƏSKİKLİK** *is.* 1. Çatışmazlıq, azlıq, natamamlıq, naqislik. □ **Əskikliyə düşmək** – ehtiyaca düşmək, yoxsullaşmaq.

2. Eyib, nöqsan, qüsur; çatışmayan cəhət. *Onun heç bir cəhətdən əskikliyi yoxdur.* – [Əkbər] *özündə bir əskiklik duyurdu.* Mir Cəlal. □ **Əskiklik gətirmək** – alçaltmaq, eyib olmaq, hörmətdən salmaq. *Belə hərəkətlər insana əskiklik gətirər.* // Alçaqlıq, rəzalət, həqarət. *..Birisi alçaqdan ucaya qalxa, kasıbçılıqdan dövlətə çata, əskiklikdən*

*hörmətə minə, heç vaxt atadan, babadan danışmağı dost tutmaz.* C.Məmmədquluzadə.

3. Yoxluq, olmama. *Onun əskikliyi indi hiss edilməkdədir.*

**ƏSKİLDİLMƏ** “Əskildilmək”dən *f.is.*

**ƏSKİLDİLMƏK** *məch.* Azaldılmaq, əskik edilmək, əskik hala salınmaq.

**ƏSKİLMƏ** “Əskilmək”dən *f.is.*

**ƏSKİLMƏK** *f.* 1. Bütöv bir şeyin bir qismi yox olmaq. *Şüşənin ağzını möhkəm qapamasan, spirt uçub əskiləcək.* // Azalmaq. *Adamların sayı getdikcə əskilir. – Əskilməsin təravətin ey əşki-laləgun.* Füzuli. *Günəş qüruba doğru əyilmiş, hərəkət əskilmişdi.* S.Hüseyn.

2. *məc.* Alçalmaq, özünü alçaltmaq, hörmətdən, nüfuzdan salmaq.

**ƏSKİLTMƏ** “Əskiltmək”dən *f.is.*

**ƏSKİLTMƏK** *f.* 1. Əskik etmək, azaltmaq. *Lampanın işığını bir az əskilt. Sürəti əskiltmək. Tələblərini əskiltmək. – Səlim bəy qazancını əskiltmək üçün işçilərin zəhmət haqqını azaltmağa başladı.* H.Nəzərli. // Gödəltmək, qısaltmaq. *Paltarın ətəyindən əskiltmək lazımdır.*

2. *məc.* Hörmətdən, nüfuzdan salmaq, alçaltmaq. *Bu hərəkət kollektivin yanında onu çox əskiltdi.*

**ƏSKİMƏ** “Əskimək”dən *f.is.*

**ƏSKİMƏK** b a x **əsgiləşmək**. *Ən yaxşı sözləri seçərək bir-bir*; *Bunlar əskimişdir, – deyə uduxur.* S.Vurğun.

**ƏSKİMİŞ** *f.sif.* Köhnəlmiş. *Şamil* [Aslan bəyi] *diqqətlə müayinə etdi, .. onda əskimiş, gəmiklərinə qədər işləmiş beş-altı xəstəlik tapdı.* A.Şaiq. *Əyilsin səcdənə ulduzlar, aylar; Əskimiş məbədlər, yeni saraylar.* S.Vurğun.

**ƏSLA** *zərf* [*ər.*] Heç, heç bir vaxt, qətiyyən. *Bu işdən onun əsla xəbəri olmamışdır.* – [Rüstəm bəy:] *Sizin şimalda kişilər həlimdirlər ki, arvadları və ya qızları özgələri ilə gəzib danışdıqda qanları əsla coşmayır.* Çəmənzəminli. [Xəyyam:] *Alın, əsla ələ keçməz bu kitab.* H.Cavid. *..Şagirdlərin savadı müxtəlif idi. Aramızda əsla savadı olmayanlar da var idi.* T.Ş.Simurq.

**ƏSLƏHƏ** *is.* [*ər.* “silah” söz. cəmi] Silah. *Evlərə od vurulduqda gizlin əsləhə anbarı partladı, çox qiymətli şeylər tələf oldu.* M.S.Ordubadi.

**ƏSLƏHƏLİ** *sif.* Silahlı, silahlanmış. *Əsləhəli adamlar.* – [Sadıq bəy:] *Tamam kənd əhli də yaraqlı, əsləhəli onun buyruqlarına itaət eləməkdədirlər.* Ə.Haqverdiyev.

**ƏSLƏN** *zərf* [*ər.*] 1. Nəsli, əsli etibarilə, əsilcə, soyca. *O, əslən azərbaycanlıdır. Bəsrədə böyümüşdür, lakin əslən gürcüstanlıdır. – Əslən əmsarlı olan bu adamın hər sözündə .. gələcəkdə nələr görüləcəyinə yaxşı vaqif olan bir adamın təmkini və sakitliyi vardı.* Ə.Sadıq.

2. B a x **əsla**. [Məşədi Həsən:] *Bilsə idim, əslən özümü dolaşdırmaz idim.* Ə.Haqverdiyev. *Maya zəhərləndi, qaşqabaq və kədər əslən ona yaraşmadığından üzünün dumanı artdı.* M.İbrahimov.

**ƏSLİBAHAR** *is.* Yaya yaxın açan və gözəl iyli gül. *Əslibahar qızılgülə çatmaz.*

**ƏSMƏ** 1. “Əsmək”dən *f.is.*

2. B a x **əsməcə**. *Əsmə azarı. Əsmə tutmuşdur. – Məs geyinib, məsi var; Canında əsməsi var.* (Bayatı). *...Salamın vücudundan bir əsmə keçdi.* Mir Cəlal.

**ƏSMƏCƏ** *is.* Bədənin və ya onun ayrı-ayrı hissələrinin titrəməsi şəklində təzahür edən xəstəlik. *Başladı əsməcə tutmuş adamlar kimi titrəməyə.* “Koroğlu”. *Mühasib əsməcə tutmuş kimi ayağa qalxdı və dişlərini qıcayaraq Sübhanverdizadəyə tərəf pis-pis baxıb .. çıxdı.* S.Rəhimov.

**ƏSMƏCƏLİ** *sif.* Əsməcə xəstəliyinə tutulmuş, əsməsi olan.

**ƏSMƏK** *f.* 1. Titrəmək. *Soyuqdan yarpaq kimi əsirdi. Dodağı əsmək. Əli əsmək. Başı əsmək. – Xədicə əli əsə-əsə* (z.) *torbanın ağzını açdı.* S.S.Axundov. *...Dərvişin əlləri yarpaq kimi əsirdi.* A.Divanbəyoğlu. *Hər vətən deyəndə yaşarıb gözün; Dodağın titrəyib dilin əsibdir.* R.Rza.

2. Hərəkət etmək, dalğalanmaq. *Bərk külək əsir. – Səhər zamanıydı əsərkən yellər; Düşərkən jalələr oyatdı səni.* H.Cavid. *Hava qaranlıqlaşırdı. Gündüzdən əsməyə başlamış külək yatmışdı.* T.Ş.Simurq. *Əsdikcə gilavar, oynardı bulvar.* M.Müşfiq.

3. *məc.* Əsəbiləşmək, özündən çıxmaq, hirslənmək. *Nə əsirsən? – ..Qoca kişi acıq-*

*dan əsdi. Bir söz deməyə nə qədər qəsd etdisə, nitqi bağlandı.* A.Divanbəyoğlu.

4. Həddindən artıq qayğısını çəkmək, gözündən iraq qoymamaq, həddindən artıq əzizləmək, istəmək. *Ana balanın üstündə əsir. Oğlu üçün əsir.* – [Kitabxanaçı:] *Kitabların üstündə qırx ildir əsmirəmmi?* Mir Cəlal.

**ƏSMƏQOVAQ** *is. bot.* Qovağın bir növü.

**ƏSMƏR** *sif.* [*ər.*] Qarabuğdayı, qarayağız. *Əsmər qadın. Əsmər bənizli. – Yenə də bir vuraydı qəlbimiz gizli-gizli; Sən, ey əsmər bənizli!* M.Müşfiq. *İstərəm şəfqətlə hər səhər, axşam; Əsmər saçlarını sevəm, oxşayam.* O.Sarıvəlli.

**ƏSMƏRLƏŞMƏ** "Əsmərləşmək"dən *f.is.*

**ƏSMƏRLƏŞMƏK** *f.* Qaralaşmaq, qarabuğdayı olmaq. *O gənc qadının .. günəşdən əsmərləşən gənc çöhrəsində bir bahar təravəti duyulurdu.* İ.Əfəndiyev.

**ƏSMƏRLİK** *is.* Qarabuğdayılıq, qarayağızlıq.

**ƏSNA** *is.* [*ər.*] Vaxt, zaman, an. *Bu əsnada küçədə hay-küy qalxdı. – Bu əsnada yaxındakı uca dağın təpəsində gözəl bir qız surətində nurani bir kölgə zahir olur.* A.Səhhət. [Mirzə] .. *söhbət əsnasında cibindən qozdan, fındıqdan, kişmişdən çıxarıb ortalığa tökərdi.* Ə.Haqverdiyev. *Bu əsnada qapı ehmal açıldı, içəri on yeddi-on səkkiz yaşlarında, qırmızıyanaq, burnunun dəlikləri geniş bir gənc girdi.* Çəmənzəminli.

**ƏSNAF** *is.* [*ər.* "sinf" söz. cəmi] Sənətkarlar, peşəkarlar (dükançılar, dəmirçilər, misgərlər və s.); kustar – *..Məclisdə oturan əsnaflar .. rusca danışılan mətləbləri başa düşmürdülər.* C.Məmmədquluzadə. *Papaqların bəzisi uzun qovun çeşnisində idi, bunlar əsnaf papağı idi.* Çəmənzəminli.

**ƏSNAFLIQ** *is.* Sənətkarlıq, peşəkarlıq, kustarlıq.

**ƏSNƏGÜLÜ** bax **əspərək**. *Keçmişdə xalq təbabətində qızılcaya qarşı çox işlənən əsnəgülü bitkisinin tərkibində alkoloidin tapılmasını xüsusilə qeyd etmək lazımdır.* Ə.Abasov.

**ƏSNƏK** 1. *sif.* Çox əsnəyən.

2. *is.* Əsnəmə. *Əsnək gəlmək. – Əsnək əsnək gətirər.* (Ata. sözü).

3. *anat.* Ağız boşluğundan qırtlağa gedən deşik. *Xəstənin əsnəyi qızarır və şişir, bozumtul ağ rəngli ərp əmələ gəlir.*

**ƏSNƏMƏ** "Əsnəmək"dən *f.is. Darıxanda adamı əsnəmə tutar. – Əsnəmə, gərnəşmə əl çəkməz, çıxar guya canın; Hansı pünhanındadır bu aşikarın ləzzəti?* Ə.Nəzmi. *Mövlamqulunun nəfəsi yavaş-yavaş genişlənir, onu əsnəmə tuturdu.* S.Rəhimov.

**ƏSNƏMƏK** *f.* Yuxu gəldikdə, yaxud yuxudan təzə ayılanda, yaxud da yorğunluq nəticəsində qeyri-iradi olaraq ağzını geniş açaraq dərindən və davamlı surətdə nəfəsini içəri çəkib dərhal buraxmaq. *Mənim yuxum qaçır, nənəm əsnəyir.* A.Səhhət. *Övrət bikar oturub başlayır əsnəməyə.* C.Məmmədquluzadə. *Katibə yorğunluğunu gizlədə bilməyib əsnəyəndə əlini ağzına tutdu.* M.Hüseyn.

**ƏSNƏŞMƏ** "Əsnəşmək"dən *f.is. Məclisdə əsnəşmə düşdü.*

**ƏSNƏŞMƏK** *qarş.* 1. Bərabər, birlikdə əsnəmək, hamı bir-birinə baxıb əsnəmək.

2. *məc.* Boş-boşuna vaxt keçirmək.

**ƏSPƏRƏK** *is. bot.* Quru və daşlı yamaclarda bitən bitki.

**ƏSR** [*ər.*] 1. 100 illik dövr. *On səkkizinci əsr. İndiki əsr. Keçən əsrdə. Əsrlər boyu*(*nca*). – *Əsrlərdən bəri, dərdinə qaldığım yerdir bu yerlər.* M.Müşfiq. *Gözümdən günlər keçir; Əsrlərə bərabər; Zülmətləri əridən; Qaynar, şəfəqli günlər.* R.Rza.

2. Dövr, zaman, vaxt, çağ. [Heydər bəy:] *Pərvərdigara, bu necə əsrdir, bu necə zamandır? Nə at çapmağın qiyməti var, nə tüfəng atmağın hörməti var.* M.F.Axundzadə. *..Bunu istəyirik biləк ki, aya bu papaqlar hansı əsrdən və nə vaxt bu tövr bizim içimizdə adət olubdur?* C.Məmmədquluzadə. [Bəypolad Cəmil bəyə:] *Sən bu əsr üçün deyil, bəlkə başqa bir zaman üçün yaradılmışsan.* H.Cavid.

3. Hər hansı bir cəhətdən səciyyəvi olan dövr; epoxa. *Orta əsrlər. Atom əsri. Nizami əsri.*

4. İkindi vaxtı, axşamüstü.

**ƏSRAR** *is.* [*ər.* "sirr" söz. cəmi] Sirlər. *Mən belə əsrarı qana bilmərəm; Qanmaz olub da dayana bilmərəm.* M.Ə.Sabir. *Səndə*

*var, bəlli, bir yığın əsrar; Söylə, aç söylə, bivəfa, qəddar!* H.Cavid.

**ƏSRARƏNGİZ** *sif.* [*ər.* əsrar və *fars.* ...ən-giz] Sirli, əsrarlı, sirr ilə dolu; anlaşılmaz. *Bu qızın fitnəli və əsrarəngiz gözləri var idi.* M.S.Ordubadi. *Həyatə girdikdə əsrarəngiz və heyrətamiz sükut insanı vahiməyə salırdı.* M.İbrahimov.

**ƏSRARƏNGİZLİK** *is.* Sirlilik, sirlə dolu olma, anlaşılmazlıq. *Qəhrəman təbiətin bu əsrarəngizliyi içində düşünür.* S.Rəhimov.

**ƏSRARLI** *sif.* Sirli. *..Sehrli, əsrarlı bu həyat nədir? Həm gülünc, həm qorxunc bir əfsanədir...* A.Şaiq. *Əsrarlı və boğucu sükut yenə məhbəsi bürümüşdü.* M.İbrahimov. [Əhməd] *Cəmilənin öz iş otağına çəkildiyini görüb ayağa durdu, hərləndi, yavaşca yenə həmin əsrarlı künc otağa keçdi.* S.Rəhimov.

**ƏSRDİDƏ** *sif.* [*ər.* əsr və *fars.* ...didə] Qoca, köhnə, qədim. *..Bazarın başında, yanından şırhaşırla bulaq axan əsrdidə bir çinar ağacı vardı.* Ə.Əbülhəsən. *Hələ gecə ikən* [Qaraca Çoban] *meşədən iri gövdəli əsrdidə ağaclardan qırdırdı.* M.Rzaquluzadə.

**ƏSRİ** *sif.* Müasir, əsrə müvafiq, yaxud əsrə aid olan.

**ƏSRİK** *sif.* 1. Kökəlib yekəlmiş.

2. Qızmış.

**ƏSRİMƏ** "Əsrimək"dən *f.is.*

**ƏSRİMƏK** *f.* Qızmaq, coşmaq, azğınlaş-maq. *Əsriyib-əsriyib, kükrəyib axan; Ağzı ağköpüklü divanə Samur!* Aşıq Valeh.

**ƏSRİMİŞ** *f.sif.* Qızmış, coşmuş. *Əsrimiş pələng. – Çənlibel üstündə əsrimiş nərsən; Düşmən qabağında dayanan ərsən.* "Koroğlu". *Girəndə meydan içinə; Əsrimiş aslanı gördüm.* Aşıq Teymur.

**ƏSRİYİB-KÜKRƏMƏK** *f.* Özündən çıx-maq, hiddətlənmək, bərk hirslənmək, qızı-şıb hədələmək.

**ƏSRLƏRCƏ** *zərf.* Əsrlər boyu, əsrlər ər-zində. *Əsrlərcə əsarət altında qalan müs-təmləkə xalqları azadlığa qovuşdular.*

**ƏSRLİK** *sif.* Bir əsr davam edən, yaşa-yan, sürən. *Qış günəşi isə ağır-ağır, əsrlik təmkini ilə qalxır.* Mir Cəlal.

**ƏSSALAM** *nida* [*ər.*] *köhn.* Sizə salam-(lar) olsun.

**ƏSTƏĞFÜR(ULLAH)** *nida* [*ər.*] Əsil mə-nası "Allahdan bağışlanmağımı istəyirəm" deməkdir. Bəzən Azərbaycan dilində "Allah eləməsin, haşa, əsla, qətiyyən, heç vaxt, heç elə şey ola bilməz, heç elə şeyə razı ola bilmərəm" mənalarında da işlənir. *Əstəğfürullah, heç kəs getməyəcək və öy-rənməyəcək, bu dərd-qüssədir məni bu hala salan..* N.Vəzirov.

**ƏŞ** *is.* 1. Tay, bərabər, misil, bənzər. *Yox-dur mənə göydə əş; Deyərkən, getdi sərkəş.* Ə.Cavad.

2. Dost, yar, həmdəm, yoldaş. *Mənim də var baharım; Çiçəklərim, günəşim; Qəlbim, ruhum, işarım: Tapındığım şux əşim.* A.Şaiq. *Söylədilər səni könlümün əşi; Həqiqətmi, o da xülyamı yoxsa?* S.Vurğun. *Ey dostluqdan yorulmaz mənim sevimli əşim; Sənə olan eşqimi söndürmədi illər də.* N.Rəfibəyli.

**ƏŞAR** *is.* [*ər.* "şeir" söz. cəmi] Şeirlər. *Şairəm, çünki vəzifəm budur əşar yazım; Gördüyüm nikü bədi eyləyim izhar, yazım.* M.Ə.Sabir. *..Hərəmiz bir istəkan çay içən-dən sonra .. yoldaşım Teymur mirzə yazdığı əşarından bir neçəsini bizə oxudu.* C.Məm-mədquluzadə. *Cavan Hüseyn hərdən-hər-dən; Yazır öz əşarın, dağlar!* Aşıq Hüseyn.

**ƏŞƏDD** *sif.* [*ər.*] Şiddətli, güclü, son də-rəcə (çox). [Rza bəy:] *Əfəndilər, müsaidə-nizlə bir qaç kəlmə söz ifadəsinə əşəddi ehtiyacım vardır.* Ü.Hacıbəyov.

**ƏŞƏR** *is.* [*ər.*] *tar.* Keçmişdə müəyyən məqsədlər üçün gəlirin onda biri miqda-rında verilən vergi.

**ƏŞXAS** *is.* [*ər.* "şəxs" söz. cəmi] *köhn.* Şəxslər, adamlar. *Əşxas fərmayişi əmələ gətirdilər.* M.F.Axundzadə. *Xərc edir bir para əşxas pulun bayramdə; Zəfərana, yağa, razyanaya, xaşxaşa, ətə.* M.Ə.Sabir. *Bizim müsəlmanlar arasında arif və qanacaqlı əş-xaslar çoxdur.* N.Vəzirov. *Əşxasi-hökumət hamı heyran olur olsa; Hər qüvvətin üstün-də də bir qüvvət olarmış!* Ə.Nəzmi. ☐ **Əşxa-si-məclis** – b a x **əhli-məclis** ("**əhl**"də).

**ƏŞİ** *nida.* "A kişi" sözünün canlı dildə işlənən ixtisar şəkli olub, yerinə görə etinasızlıq, narazılıq, yaxud təkid və s. hiss-ləri ifadə edir. *Əşi, tez ol da! Əşi, mən nə bilim. Əşi, o da yoldaşdır! Əşi, qoy getsin!* – [Sultan bəy:] *Əşi, xan ilə aş yemirəm ki, bığım yağa batar...* Ü.Hacıbəyov. [Hüseyn:]

*Mən nə bilim, əşi, onun qolu necə olub?..* S.Rəhman. [Qulu:] *Əşi, o açarları bir bəri gətir.* İ.Əfəndiyev. [Camal:] *Əşi, ay Nəbi dayı, indidən niyə toyuq təkin hinə girmisiniz? Günün qulağı təzə batıb ki.* Ə.Abasov.

**ƏŞİRƏT** *is.* [*ər.*] Bir əsildən törəyib birlikdə yaşayan və köçəri (bədəvi) həyat sürən ailələr toplusu; qəbilə, oymaq. *Əşirət dövrü. Ərəb əşirətləri. Əşirət şeyxi* (ağası, bəyi). *Əşirət halında yaşayan tayfalar. – Bütün Azərbaycan xanları və əşirətlər öz atlısı ilə Marağaya və Savucbulaq ətrafına gəlmişdi.* M.S.Ordubadi.

**ƏŞK** *is.* [*fars.*] *klas.* Göz yaşı. *Hicran gecəsi gəldi ki, hər qətreyi-əşkim; Pərvanələrə şəmi-şəbistan olacaqdır.* Qövsi. *Gecəgündüz ağlamaqdan əşki-xun; Saralıb gül rəngi solubdu, gördüm.* Q.Zakir. *Gözümdə cari edib əşk həm rəvan, getmə!* X.Natəvan.

**ƏŞKAL** *is.* [*ər.* "şəkl" söz. cəmi] Şəkillər, şəkil. [Məstəli şah:] *Xurcunu yerə qoy, ağzının bağını aç, içindən üstündə əşkal çəkilmiş taxta parçaları çıxart.* M.F.Axundzadə.

**ƏŞKBAR** *sif.* [*fars.*] *klas.* Göz yaşı tökən, çox ağlayan. *Yağma, canım, naleyi-biixtiyarımdan saqın; Tökmə qanım, abi-çeşmi-əşkbarımdan saqın.* Füzuli. *Saldı məni damə zülfün xəyalı; Məni qoydun əşkbarda, gəlmədin.* Sarı Aşıq. ☐ **Əşkbar olmaq** *klas.* – göz yaşı tökmək, çox ağlamaq. *Bir sürü cəllad əlindən əşkbar olmuş cəhan.* M.Hadi.

**ƏŞRAF** *is.* [*ər.* "şərif" söz. cəmi] *köhn.* Əyanlar, nüfuzlu adamlar, kübarlar. *Ərkanidövlət, üləma, .. əyan və əşraf və ərbabimənasib otağın qabağında səf çəkib əl-əl üstə durdular.* M.F.Axundzadə. *Bütün əşraf ikən qızın vurğunu; Bəbir xan kimsəyə vermədi onu.* H.Cavid.

**ƏŞRƏF** *sif.* [*ər.*] *köhn.* Ən şərafətli, ən əziz, çox hörmətli. [Arif:] *Bir fəzilətsə öldürüb ölmək; Canavar bizdən əşrəf olsa gərək.* H.Cavid. *Budur, Yer üzünün əşrəfi insan; Yaradır gündə bir hicranlı dastan.* S.Vurğun. [Gülyanaq:] *Təbiətdə mövcud olan bütün gözəlliklərin gözəli, həyatın əşrəfi olan insandır.* Ə.Vəliyev.

**ƏŞRƏFİ** *is.* [*ər.*] *köhn.* Keçmişdə: beş manatlıq qızıl pul. *Əşrəfi keçmişdə zinət olaraq işlənirdi. – Zərxaradan arxalıq; Əşrəfidən yaxalıq; Bir busə ver o xaldan; Dadına çatsın xalıq.* (Bayatı). [Koroğlu Qırata:] *Əzəldən bilsəydim sənin halını; Əşrəfidən kəsdirərdim nalını.* "Koroğlu". [Xanımın] *ətəyində bir sıra əşrəfi, boynunda qızıllı şəvəsi vardı.* Çəmənzəminli. // Ümumiyyətlə, qızıl pul. *Pəri Soltan gülüb, Əhmədnən xudafiz eləyəndən sonra, zindandan çıxdı. Bir çəngə əşrəfi də zindanbanın ətəyinə töküb, qəmli-qəmli gəldi mənzilinə.* (Nağıl).

**ƏŞRƏFİLİ** *sif.* Bəzək üçün əşrəfi taxılmış, əşrəfi asılmış. *Ətəyi əşrəfili paltar. – Ucu əşrəfili bulud kimi saç; Dal gərdəndə hər hörüyü bir qolac.* M.P.Vaqif.

**ƏŞSİZ** *sif.* 1. Tayı, bərabəri, misli olmayan.

2. Dostu, yaxın adamı, həmdəmi olmayan; tək.

**ƏŞSİZLİK** *is.* 1. Tayı, bərabəri, misli olmama.

2. Dostu, həmdəmi olmama; təklik.

**ƏŞYA** *is.* [*ər.* "şey" söz. cəmi] 1. Şeylər. *Ev əşyası. – Nişandan toya qədər qız evi qıza veriləsi cehiz əşyasını tədarük etməklə məşğul olur.* R.Əfəndiyev. *Məsmənin otağı ev əşyasından tamamilə boş imiş.* S.Hüseyn. *Səttarxan Tehrana köçdükdə ev əşyasını aparmamışdı.* M.S.Ordubadi. [Qadir] *bütün süslü-bəzəkli əşyasını bir boğçaya bağladı və hamamçıya tapşırdı.* H.Sarabski.

2. *fəls.* Hiss orqanları tərəfindən qavranılan hər hansı bir konkret maddi hadisə, şey, obyekt. *Əşya ilə onu ifadə edən söz arasında əlaqə.* – [Divanə:] *Məncə həm mahiyyəti-əşya bütün; Başqa rəng almaqdadır guya bu gün.* H.Cavid.

◊ **Əşyayi-dəlil** *hüq.* – müttəhimin günahkar olub-olmadığını sübut edən hər hansı bir şey, maddi sübut. *Məhkəməyə əşyayidəlil təqdim etmək.*

**ƏT** *is.* 1. Canlıların bədənində sümüklə dəri arasındakı maddə; əzələ toxumalarının adi adı. // Heyvan və insan bədəninin yumşaq hissəsi. *Əti sümükdən ayırmaq.*

2. Kəsilmiş heyvan bədəninin xörəyə işlənən qismi. *Qoyun əti. Toyuq əti. Mal əti. Bişmiş ət. Çiy ət. – ..Əti, çörəyi, qəndi bizə birə-iki qiymətə satırlar.* C.Məmmədquluzadə. *Ət almır, arvaddan küftə istəyir;*

*Olmayanda tutur toy, bizim kişi.* Aşıq Hüseyn. □ **Ət baltası** – ət doğramaq üçün balta. **Ət daşı** – üstündə ət döymək üçün bərk daş. **Ət döymək** – ətin sümüksüz qismini xırda-xırda doğramaq. **Ət taxtası** – üstündə ət döyülən və ya doğranan girdə və ya dördkünc qalın və bərk taxta. *Ülfət yerdə oturub ət taxtasını təmizləyirdi.* Mir Cəlal.

3. Bədən, vücud, əndam mənasında. *Ətindən elə bil kəsdilər. Güllə ətə dəydi.* – [Fərəc:] *Bu ət, bu əndam mənim başıma lap bəla oldu.* H.Arif.

4. Meyvənin qabığı altında olan yeməli yumşaq hissəsi. *Almanın əti. Şaftalının əti.*

◊ **Ət asmaq** – bişmək (qaynamaq) üçün əti qazanda od üstünə qoymaq. **Ət basmaq** – çox kökəlmək, ətlənmək. [Firidun] *uzunboylu, canlı və bütün boynunu ət basmış Hikmət İsfahanini diqqətlə süzdü.* M.İbrahimov. **Ət gəlmək** – bədənin yaralanmış yerinin üstü ətlə örtülmək, sağalmaq, yarası qapanmaq. **Ət tökmək** – çox arıqlamaq. **Ətdən düşmək** – arıqlamaq, zəifləmək. **Ətdən-qandan olmaq** – çox arıqlamaq, zəifləmək. **Ətə dönmək** – süstləşmək, keyləşmək, atilləşmək, hərəkət edə bilməyəcək bir hala gəlmək. **Ətə gəlmək** – bir qədər kökəlmək. **Ətə gətirmək** – kökəltmək. **Ətə-cana (ətə-qana) dolmaq** – bir qədər kökəlmək, yaxşılaşmaq, sağlamlaşmaq. *..Səkinə otuz yaşına çatmışdı, ətə-cana dolmuş, gözəlləşmiş, gərdənli bir qadın olmuşdu.* M.İbrahimov. [Tahir] *son illərdə ətə-qana dolmuşdu.* M.Hüseyn. **Ətə-cana gəlmək** – b a x **ətə-qana dolmaq.** *Nurəddin kəndə gələndən sonra, bir ayın ərzində tanımaq olmurdu. Ətə-cana gəlib üzü lalə kimi qızarmışdı.* S.S.Axundov. *İnsafsız qurd gülə-gülə; Dedi sevinə-sevinə: – Bu uşaqlar kökəlsinlər; Ətə-cana gəlsinlər.* M.Dilbazi. **Ətə-cana (ətə-qana) gətirmək** – bir qədər kökəltmək, sağlamlaşdırmaq, canlandırmaq. **Əti çimçişmək** – 1) iyrənmək, çiyrənmək. [Əşrəfin] *əti çimçişdi, bu rütubətli zirzəmidə qalmağı şəninə sığışdırmadı, ayağa durub qapını sındırmaq və birbaş yataqxanaya yollanmaq istədi.* İ.Şıxlı; 2) ürpərmək. *Yağışın suyu* [Seymurun] *boynuna, bədəninə süzüldü, əti çimçişdi.* İ.Məlikzadə. **Əti tökülmək** – 1) arıqlamaq, zəifləmək; 2) xoşagəlməz bir iş, hərəkət və s. qarşısında özündə iyrənclik, xəcalət hissi duymaq. *O danışanda adamın əti tökülür.* **Əti ürpərmək** – qorxmaqdan, hürkməkdən və s. Hisslərdən tükləri qabarıb biz-biz durmaq, dəhşətə gəlmək. *Həmzənin əti ürpərdi, vücudu titrəyib lərzəyə gəldi. Gözləri ala-qara çaldı.* Ə.Vəliyev. **Ətimi (ətimizi) tökmə! –** utandırma! xəcalət vermə! *..İndi, bu saat bizim övrətlərimiz evdə oturub saqqız çeynəyirlər. Onlar bizim sözümüzü başa düşməyəcəklər və bizə belə cavab verəcəklər*: *“Sən allah, a kişi, ətimizi tökmə!”* C.Məmmədquluzadə. **Ətin tökülsün!** – utan! xəcalət çək! həyan olsun! **Ətini kəsmək (didmək)** – çox əziyyət vermək, çox incitmək. [Əbdül:] *Vallah, o qədər yanmışam ki, istəyirəm* [Gülnisənin] *ətini didəm.* C.Cabbarlı. *Fatı birdən ətini kəsirlərmiş kimi fasiləsiz qışqırdı.* Ə.Abasov. **Ətlə dırnaq arasına girmək** – bir-birinə çox yaxın olan adamların işinə qarışmaq. **Ətini şişə çəkmək** – çox incitmək, çox əziyyət vermək. [Mahmud bəy:] *Başına and olsun, əlimə düşə; Mən onun ətini çəkərəm şişə.* S.Rüstəm. **Bir köynək ət tökmək** – b a x **köynək-köynək ət tökmək**. *Teymur saqi olmaq istəmədiyini deyənəcən bir köynək ət tökdü.* M.Hüseyn. **Köynək-köynək ət tökmək** – son dərəcə utanmaq, xəcalət çəkmək. *Əziz Gülsabahın eşqini soyuq səngərlərdə qönçə halında saxlayıb qaytardığını Bayram kişi biləndə köynək-köynək ət tökməli idi.* Ə.Vəliyev.

**ƏTA** *is.* [*ər.*] *klas.* Vermə, veriş. // Bağışlanma. *Kiçikdən xəta, böyükdən əta.* (Ata. sözü). □ **Əta etmək (eləmək)** – bağışlamaq. *Təmir üçün etdi çox ətalər; Tədric ilə qıldı çox binalər.* Füzuli. [Mirzə:] *Amma ağadan* [xahişim] *budur, əgər iltifatınız olsa, bəndəyə bir yabı əta eləyəsiniz.* Ə.Haqverdiyev.

**ƏTALƏT** *is.* [*ər.*] Hərəkətsizlik, fəaliyyətsizlik, süstlük, boş durma; tənbəllik. *Həvəs sövq eylər insanı həyatə; Ətalət cəlb edər şəxsi məmatə.* M.Ə.Sabir. *Qəlyan xorulda-dıqca yuxuya bənzər qəribə bir ətalət* [Hikmət İsfahaninin] *bütün bədənini bürüyürdü.* M.İbrahimov. *İsti və bürkü adamlarda tən-*

*bəllik, ətalət əmələ gətirmiş və onlar harada isə gizlənmişdilər.* S.Rəhman. ☐ **Ətalət basmaq** – tənbəllik basmaq, işləməyə, hərəkət etməyə həvəsi olmamaq, tənbəllik etmək.

**ƏTALƏTLİ** *sif.* 1. Hərəkətsiz, fəaliyyətsiz, süst; tənbəl. [Uzundərə] *əski Şərqin tələsmək bilməyən ətalətli ruhunu özündə saxladığı üçün maraqsız deyildi.* S.Hüseyn.

2. *fiz.* Hərəkətdə olan cismin xarici təsir olmadan öz müntəzəm hərəkətini, sükunətdə olan cismin isə öz sükunətini saxlama xassəsi; inersiya. *Ətalət qanunu.*

**ƏTBALA** bax **ətcəbala**. *Ətbala qaranquş. – Uşaqlıq həyatı! Ətbala quş qanadlar altında pərvəriş tapan kimi, sən də isti ana qucağına sığınır, bütün dünyanın səadətini bu doğma yuvada tapırsan.* Mir Cəlal.

**ƏTBAŞ** *sif. dan.* Ağılsız, gec anlayan, gec başa düşən; kütbeyin.

**ƏTCƏ** *is.* 1. Çılpaq uşaq bədəni.

2. Bax **ətcəbala**. *Yuvada yumurtadan yenicə çıxmış ətcə kəklik balaları vardı.*

**ƏTCƏBALA** *is.* Yumurtadan lələksiz və gözləri açılmamış halda çıxan quş balası. *..Əlimi yuvaya soxdum və tüksüz ətcəbalaların üstündən ana alacəhrəni tutub .. ağacdan endim.* S.S.Axundov. *..Orada bala-bala cücələr var, bax belə-belə, cıb-cıbılı, ətcəbala.* S.Rəhimov. *Ətcəbala bir dolaşa; Dili dolaşa-dolaşa; Çaldı uzun bir fişqırıq.* M.Dilbazi. // Lüt körpə uşaq haqqında.

**ƏTÇƏKƏN** *is.* Əti xırda-xırda doğramaq üçün maşın.

**ƏTÇİ** *is.* Ətsatan.

**ƏTÇİLİK** *is.* Ətlik heyvan yetişdirmə işi. *Ətçilik təsərrüfatı.*

**ƏTDOĞRAYAN** *is.* 1. Ət döymək, doğramaq üçün kiçik kəsərti; qiyməkeş. *Qonşudan ətdoğrayanı gətir.*

2. Kəsilmiş heyvanın ətini doğrayan adam; qəssab.

3. Bax **ətçəkən**.

**ƏTDÖYƏN** bax **ətdoğrayan** 1 və 3-cü mənalarda.

**ƏTƏC** *is. məh.* Yun təmizləyən alət.

**ƏTƏK** *is.* 1. Paltarın beldən aşağı tərəfə uzanan hissəsi. *Paltonun ətəyi uzundur. Pencəyin ətəyini bir qədər qısaltmaq lazımdır. – Sancıb belə nazənin ətəklər; Cəm eyləyəlim gözəl çiçəklər.* Füzuli. *Dəli Səməd ətəklərini çırpıb, durub getdi və dala baxa-baxa gülümsünüb deyirdi..* Çəmənzəminli. *Bacı və qardaş ətəklərinə yığdıqları qulancarları yerə töküb oturdular..* S.S.Axundov. // Paltar ətəyinə oxşayan hər şey. *Şeyxin anası çadırın ətəyini qaldırıb hara isə baxır, sonra oğluna tərəf dönür.* Ə.Məmmədxanlı.

2. Dağın, yamacın və ümumiyyətlə, hündür yerin aşağı tərəfləri. *Dağ ətəyi. – Qarabağda dağın ətəyində, .. çəməndə atlı dəstəsi sərkərdəsi Qəhrəman yüzbaşı .. fikirli oturubdur.* C.Məmmədquluzadə. *Uzaqda bir təpə ətəyində beş-on alaçıqdan ibarət bir oba görünürdü.* A.Şaiq. *Getdikcə ağacların sayı artır və dağların çılpaq ətək və zirvələri də yaşıl dona bürünür.* M.İbrahimov. // Bir yerin yaxını, yaxın tərəfi. *Meşənin ətəyi. – Hər il bu zaman yolun ətəklərinə qədər çadırlar, obalar düşərmiş.* Mir Cəlal.

3. Ağac budaqlarının, qalxandan sonra aşağı əyilən yerləri, alçaq hissəsi. *Ağacın ətəyini qırmaq. Tut ağacının ətəklərindəki tutları uşaqlar yeyib qurtarmışlar.*

4. Adətən "bir" sözü ilə – qeyri-müəyyən çoxluq bildirir. [Məşədi İbad:] *Zarafat deyildir, bir ətək pul verirəm, bir baxım görüm, mal nə cür maldır, verdiyim pula dəyərmi?* Ü.Hacıbəyov. [Seyid Əhməd:] *Mən iki dəfə bu şəhərə gəlib, hər dəfəsində bir ətək pul aparmışam.* Ə.Haqverdiyev. [Gileygüzarov:] *Bir görün nadan yenə bir ətək pul qazandı. Mənimsə sandıqda xoruz səsi eşitməmiş gül kimi əsərlərim çap olunmamış yatıb qalır.* S.Rüstəm.

◊ **Ətək altdan ötürmək** – 1) xəlvəti, gizli vermək; 2) yaddan çıxarmaq, unutmaq. *Bəzən böyük kitablardan nümunələr gətirir; Lakin vicdan kitabını ətək altdan ötürür.* S.Vurğun. **Ətəyin tutmaq** – bax **ətəyindən tutmaq (yapışmaq)**. *Əğyar ətəgin tutma və əğyarə yapışma.* Nəsimi. **Ətəyindən tutmaq (yapışmaq)** – yalvarmaq, himayə, kömək istəmək, pənah gətirmək. *Sığın Allahına, tut ətəyindən; Olmuş qulaqların yoxsa kar sənin.* Aşıq Məhəmməd. [Mərcan:] *Tapmısan, tut ətəyindən, bərk tut; Başqa dilbərləri artıq sən unut.* A.Şaiq. *Balama sən kömək ol; Ətəyindən tutmuşam; Qadan*

*alım, tək sənin.* B.Vahabzadə. **Ətəyini buraxmaq** – əl çəkmək, boşlamaq. [Sərdar Rəşid:] *Qoy mənim bacım Mahrunun ətəyini buraxsın, onun üçün haradan istəyirsə, mən qız tapıb evləndirim.* M.S.Ordubadi. **Ətəyini çəkmək** – qarşısını almaq, mübarizə aparmaq, yol verməmək. *Qanun pozanların ətəyini çək; Şəhər nəfəs alsın körpələr kimi!* S.Rüstəm. **Abrını ətəyinə bükmək** – bax **abır.** [Hafizə xanım:] *Vallah, bu saat abrını ətəyinə bükərəm.* Ə.Haqverdiyev. [Mürşüd:] *Sadıq! Sənin arvadın mənim abrımı bükdü ətəyimə, saldı yola.* S.Rəhman. **Daşı ətəyindən tökmək** – bax **daş**. *Canlar alan cəlladbaşı; Ətəyindən tökdü daşı.* Aşıq Həsən. **Əl mənim, ətək sənin** – bax **əl**. [Fatmanisə:] *Molla Əlyar, atam-anam sənə qurban, qələminə mənim canım qurban olsun, əl mənim, ətək sənin. Ya ətəyini kəs, ya mənim əlimi.* Ə.Haqverdiyev.

**ƏTƏKALTI** 1. *is.* Gizlicə toplanılıb saxlanılan ehtiyat – pul və başqa şey. *O, köhnə adamdır, onun çox ətəkaltısı olar.*

2. *zərf.* Gizlicə, xəlvəti.

**ƏTƏKDOLUSU** *sif.* Lap çox, həddən artıq çox.

**ƏTƏK-ƏTƏK** *zərf.* Çoxlu, çoxlu miqdarda; bol, bolluca, ətəkdolusu. *Ətək-ətək pul. – Bağlarında, bax, gül-gülü çağırır; Ətək-ətək noğul səpər hər ağac.* A.Şaiq. [Nəbi:] *Yığırdıq meşədən biz ətək-ətək; Yanağın, dodağın rəngdə çiyələk.* S.Rüstəm. *Meşədə dadlı çiyələk; Yığılırdı ətək-ətək.* M.Dilbazi.

**ƏTƏKLƏMƏ** "Ətəkləmək"dən *f.is.*

**ƏTƏKLƏMƏK** *f.* 1. Ətəyindən tutmaq, tutub saxlamaq. [Zərbəli:] *Usta, getdim, yolda ətəklədim, bir qapaz vurdu, yıxıldım..* Ə.Haqverdiyev. *Pası mollanı ətəkləyib dayandırdı.* S.Rəhimov. *Sazandalar şuluqluq düşdüyünü, toyun pozulduğunu yəqin etdilər, Məşədi Cahangiri ətəklədilər.* Mir Cəlal.

2. Ətəyinə yığmaq.

3. *məc.* Yaxalayaraq əl çəkməmək, yalvarıb xahiş etmək.

4. *məc.* Yarısını keçmək, getmək (yol haqqında). *Düzəldi mənzilə yenə dəstəmiz; Ətəkləyib yolu, vardıq birbaşa.* S.Vurğun. *Əynimdə boz şinel, belimdə yaraq; Gedirəm, yolları ətəkləyərək.* M.Rahim.

5. Ətəklə yelləmək. *Manqalı, ocağı ətəkləmək. – Cəm olubdur tamam əqli seyrəklər; Kimi odun qalar, kimi ətəklər.* Q.Zakir. *Birisi sacın altını gah piləyir, gah ətəkləyir.* Ə.Vəliyev.

**ƏTƏKLƏNMƏ** "Ətəklənmək"dən *f.is.*

**ƏTƏKLƏNMƏK** *məch.* Ətəyindən tutulmaq, tutulub saxlanmaq.

**ƏTƏKLİ** *sif.* 1. Ətəyi geniş və uzun. *Ətəkli paltar.*

2. Ətəyi, ətəkləri olan. *Yaşıl ətəkli təpələr.* – [Həcərin] *gözləri qabağından yaşıl ətəkli, təpəsi qarlı dağlar, ara-sıra "üç təpə"lərdə düşən alaçıqlar gəlib keçdi.* S.Rəhimov.

**ƏTƏKLİK** *is. köhn.* Zinət üçün qadın paltarının ətəyinə düzülən pul və s. *Ətəkliyi altun, qəsabəsi zər; Çəhrayı çarqatı qəddə bərabər.* M.P.Vaqif. *Düzülüb yaxasına qızıl yaxalıq kəsilib; Qolda qolbağı, ətəgində ətəklik asılıb.* Aşıq Zakir.

**ƏTƏNƏ** *is.* Məməlilərdə: ana bətnində balanı bürüyən və bala onun içindən çıxdıqdan sonra cırılıb düşən ət pərdəsi; son. *Son* (*ətənə*) *əsas etibarı ilə inəklərdə 2-6 saatdan, camışlarda isə 2-4 saatdan sonra düşür.*

**ƏTƏNƏLİ** *sif.* Ətənəsi olan (məməlilər haqqında).

**ƏTƏNƏSİZ** *sif.* Ətənəsi olmayan (məməlilər haqqında).

**ƏTƏR** *is. dan.* İz, əsər, əlamət, xəbər. *Ondan heç bir ətər yoxdur. – Ancaq Arzunun nəbzi çox zəif vururdu, çünki onda qan ətəri qalmamışdı.* S.Rəhimov.

**ƏTƏŞ** *is.* [*fars.*] Susuzluq, bərk susama. *Suyun səsi* [Gəldiyevdə] *ətəş oyatdı.* Mir Cəlal. □ **Ətəşini söndürmək** – su içməklə susuzluğunu rəf etmək.

**ƏTF** *is.* [*ər.*] *köhn.* Əymə, çevirmə, meyil etdirmə, yönəltmə.

**ƏTFAL** *is.* [*ər.* "tifl" söz. cəmi] *klas.* Uşaqlar, tifillər. *Bunlar bizim zükur və ünas ətfalımıza mürəbbi olurlarmı?* M.F.Axundzadə. *Olsun, olsun səninlə xoşhal; Yetsin, yetsin kəmalə ətfal.* M.Ə.Sabir. *Hər dəqiqə düşər bir əhvalə; Oxşayır tərbiyəsiz ətfalə.* A.Səhhət.

**ƏTİACI** *sif.* Öz rəftarı, hərəkəti, münasibəti, danışığı ilə başqalarını özündən inci-

dən; diliacı. *Ətiacı adam. – Ax, necə ətiacı arvadsan, – dedim, lakin birdən Yaqutu düşünüb səsimi yumşaldaraq ona yalvardım..* Ə.Məmmədxanlı. [Gülzar] *çox hövsələsiz və ətiacı* (z.) *olmuşdu.* İ.Hüseynov. // İs. mənasında. *Ətiacının biridir.*

**ƏTİACILIQ** *is.* Ətiacı adamın hərəkəti, xasiyyəti. *Ətiacılıq etmək. – Gah* [Hüseyni] *hər kəsə yazığı gələn, qarışqanı belə incitməkdən çəkinən bir rəhmdil olur, gah da bir anda anlaşılmaz bir ətiacılıq edirdi.* M.İbrahimov.

**ƏTİAÇIQ** *sif. köhn. dan.* Döşü, qolları, qıçları açıq qadın, ya qız haqqında. *Mən elə dərd çəkirəm, elin qız-gəlinini ətiaçıq görəndə mənim ürəyim cızıldayır.* S.Rəhimov.

**ƏTİQ(Ə)** *sif.* [*ər.*] Qədim, köhnə, əski. ☐ **Asari-ətiqə** – b a x **asar**. // *İs. mənasında.* Qədim şey, tapıntı. *Misir ətiqələri ilə uğraşan alimlər ehramlarda, mədfənlərdə və sair yerlərdəki şəkilləri və yazıları araşdıraraq iyirmi iki şəkil* (*hərf*) *tapmışlar.* F.Ağazadə.

**ƏTİR** *is.* [*ər.*] 1. Gözəl iy, rayihə. *Çiçəklərin ətri. – Qərənfil açdı, getdi; Ətrini saçdı, getdi; İstədim qucam yarı; Əlimdən qaçdı, getdi.* (Bayatı). *Axşam küləyi qalxar, əsər xeylicə yüngül; Gül ətrini duyduqca ötər şövqlə bülbül.* A.Səhhət. *Sərin-sərin din yelləri əsdikcə dənizin xoş rayihəsini, ucsuz-bucaqsız düzlərdəki güllərin-çiçəklərin ətrini yayırdı.* M.Rzaquluzadə. *Çöldə hər çiçəyin bir ətri olar; Hər gülün öz yeri, öz xətri olar.* N.Rəfibəyli. ☐ **Ətir çəkmək** – distillə yolu ilə ətirli maddə istehsal etmək. *Bütün aləm çiçək dərsin, ətir çəksin bu gülşəndən; Zamanın, varlığın, hüsnün rübabından yarandım mən!* S.Vurğun. *Çiçəklərdən ətir çək; Quşlardan nəğmə öyrən.* N.Rəfibəyli. **Ətir saçmaq (yaymaq, səpmək)** – xoş iy vermək. *Cəh-cəh vurar çəməndə bülbülləri; Meh əsdikcə ətir saçar gülləri.* A.Səhhət.

2. Spirtdə hazırlanmış ətirli cövhərlərin məhlulu. *Üzünə ətir vurmaq. – Onlar saçlarına zinət verməklə bərabər, özlərini Şərqin ən qiymətli ətirləri ilə ətirləmişdilər.* M.S.Ordubadi. *Ətirli qoxu vermək üçün kremlərə bəzən ətir qatırlar.* R.Əliyev.

3. B a x **ətirşah.**

**ƏTİR-ƏNBƏR** *is.* [*ər.*] b a x **ətir** 1-ci mənada.

**ƏTİRLƏMƏ** "Ətirləmək"dən *f.is.*

**ƏTİRLƏMƏK** *f.* Ətir vurmaq. *Yaylığını, saçını ətirləmək.*

**ƏTİRLƏNDİRMƏ** "Ətirləndirmək"dən *f.is.*

**ƏTİRLƏNDİRMƏK** *f.* Ətir saçmaq, ətirlə doldurmaq. *Sübhün təmiz havası, güllərin və çiçəklərin qoxusu otağı ətirləndirdi.* S.S.Axundov.

**ƏTİRLƏNMƏ** "Ətirlənmək"dən *f.is. Pərvaz həmişəki kimi şıq geyinmişdi və həmişəki kimi də pərt və məyus idi. Lakin məyusluğuna baxmayaraq, yenə də ətirlənməni unutmamışdı.* Çəmənzəminli.

**ƏTİRLƏNMƏK** 1. *qayıd.* Özünə ətir vurmaq, özünü ətirləmək. [Şəmsiyyə] *üz-gözünü yumuş, yenidən ətirlənmişdi.* M.İbrahimov. *Zərrintac xanım .. güzgü qabağına keçdi, özünə tumar verdi, ətirləndi..* S.Rəhimov.

2. *f.* Ətir iyi vermək, ətir kimi qoxu vermək. *Hər gül ətirlənib bir gülşən olsun; Gülşənin çiçəyi, gülü şən olsun.* S.Vurğun.

**ƏTİRLİ** *sif.* 1. Özündən ətir saçan; rayihəli. *Ətirli çiçəklər. Ətirli otlar. – Bu bağçalarda ev sahibləri ətirli güllər və çiçəklər əkmişdilər.* S.S.Axundov. *Sizi bir elçimi göndərmiş bahar; Yoxsa məftunsunuz ətirli gülə?* N.Rəfibəyli. *Gənc qızlar yüyürüşüb oğlanın başına ətirli dağ çiçəklərindən .. hörülmüş çələnglər qoydular.* M.Rzaquluzadə. // Xoşiyli, gözəl iyi olan. *Ətirli alma. – Doğrudan da, tütün çox ətirli .. idi.* M.Rzaquluzadə.

2. Ətir vurulmuş, ətirlənmiş. *Ətirli yaylıq. Ətirli saç.*

**ƏTİRŞAH** *is.* [*ər.* ətr və *fars.* şah] *bot.* Ətirli yarpaqları olan çoxillik çiçək (əksərən otaqlarda becərilir). *Ətirşah zəngin qolbudaqları olan, gövdəsinin aşağı hissəsi odunlaşmış kol bitkidir. – Səfər kişi .. göy-göyərti əkib biçir, şimala, cənuba gəlib-gedən yolçuların çoxunu .. söyüdgülü, ətirşahla qarşılayıb yola salır.* Mir Cəlal.

**ƏTLAS** b a x **atlaz**. *Ətlas nimtənəli, ipək köynəkli; Üstü-başı tirmə şallı Sənəm, gəl!* Xəstə Qasım.

**ƏTLƏNMƏ** "Ətlənmək"dən *f.is. Tədqiqatlarımıza görə camışlarda tezyetişgənlik, ətlənmə, daha doğrusu, diri çəkinin artması .. iş heyvanlarında olduğu kimidir.* A.Ağabəyli.

**ƏTLƏNMƏK** *f.* Ətə dolmaq, kökəlmək. *Yayda göyə buraxılan heyvanlar ətlənir.* – [Şahın] *sifəti o qədər ətlənmişdi ki, göyəm çərdəyi boyda gözləri güclə görünürdü.* P.Makulu.

**ƏTLƏŞMƏ** "Ətləşmək"dən *f.is.*

**ƏTLƏŞMƏK** *f.* 1. Ətə dönmək, ət kimi olmaq.

2. Qalıb yumşalmaq, çürüməyə başlamaq. *Armud ətləşmişdir. Qovun ətləşdi.* – [Ayı-döşəyikimilərin] *toxumları yetişəndə qozaları ağaclaşır və ya giləmeyvə şəklini alaraq ətləşir.* H.Qədirov.

**ƏTLİ** *sif.* 1. Ətcə dolğun; kök, ətli-canlı. [Kərim baba] *yaşlı olduğu halda, daima açıq, geniş çöllərdə yaşamış bu adamın üzü ətli, yanaqları qıpqırmızı, vücudu sapsağlam idi.* A.Şaiq. *Çırağın tutqun işığında* [Qaragünənin] *iri, ətli üzündəki çopurlar daha dərin görünürdü.* M.Rzaquluzadə. // Yaxşı, bol əti olan. *Ətli qoyun.*

2. Üstünü, yanlarını ət basmış. *Ayrım qızı kiçik, qumral və yanları ətli gözləri ilə gülümsəyərək dedi*: *– Qoy istədiyi qədər şikayət eləsin.* A.Şaiq. // Qalın. *Carçıyev ətli, qırmızı dodaqlarını yayıb qımışdı.* İ.Hüseynov.

3. Ətdən hazırlanmış, içərisində ət olan. *Ətli xörək. Ətli dovğa.*

4. *məc. dan.* Varlı.

**ƏTLİ-CANLI** *sif.* Kök, dolğun və iri. *Ay keçdi, il dolandı, Araz böyüdü, ətli-canlı, yaşına görə irigövdəli bir oğlan oldu.* A.Şaiq. *Maşından gödək, ətli-canlı, eni ilə uzunu bir olan, girdəsifət bir adam zorla bayıra çıxdı.* M.Rzaquluzadə. [Nazxanım] .. *ətli-canlı bir gəlin idi.* İ.Əfəndiyev.

**ƏTLİÇİLOV** *is. aşp.* Ətlə düyü qarışdırılaraq bişirilən çilov.

**ƏTLİK** *sif.* Kəsilmək (əti yeyilmək) üçün saxlanılan. *Ətlik mal. – Öküzün cütə getməyənini ətlik adına satarlar.* (Ata. sözü). *Qorxum budur ki, bu çalhaçalda Talıb pristav sizin bu ala öküzü də, üstəlik hələ mənim bu yabımı da qoşuna ətlik adına versin.* S.Rəhimov.

**ƏTLİ-QANLI** *sif.* Dolğun, sağlam.

**ƏTLİK-PİYLİK** *sif. k.t.* Ət və piy verən, ət və piy əldə etmək üçün saxlanılan. *Ətlik-piylik donuz.*

**ƏTLİK-SÜDLÜK** *sif. k.t.* Ət və süd verən, ət və süd əldə etmək üçün saxlanılan. *Ətlik-südlük camış.*

**ƏTLİLİK** *is.* Ətli heyvanın hal və keyfiyyəti.

**ƏTMƏK** *is. köhn.* Çörək. *Yanmış ətmək yeməz idin əsla.* M.Ə.Sabir. [Birinci işçi:] *Bunu gördükdə hər insan utanır? Bu qabarlar sizə ətmək qazanır!* H.Cavid.

**ƏTMƏTƏN** *is. məh.* Tüklənməmiş quş balası; ətcəbala.

**ƏTRAF** *is.* [*ər.* "tərəf" söz. cəmi] 1. Cəhətlər, tərəflər.

2. Dörd tərəf, yan-yörə; hər tərəf. *Ətrafına göz gəzdirmək. Ətrafda heç kəsi görmədik.* – [Səltənət:] *Ətrafı gözdən keçirdikcə insanın könlü açılır.* H.Cavid. *Ətraf kölgəli bir səhər qədər işıqlı idi.* H.Nəzərli. *Eldar ətrafa yaxşı bələd olduğundan yaxında iri, sərin kölgəli bir söyüd ağacını göstərərək*: *– Gedək, bir az dincələk, – dedi.* M.Rzaquluzadə. ☐ **Ətrafını almaq (tutmaq, sarımaq, əhatə etmək)** – əhatə etmək, dövrələmək, mühasirə etmək; çulğalamaq.

3. Yanlar. *Təkərin ətrafı dəmirlə qurşanmışdır. Yolun ətrafı.*

4. Yaxında olan yerlər. *Ətrafa qar düşmüşdür. Ətrafda taxıllar göyərib. Bu ətrafda* (bu yerlərdə). – *O ətrafda bir yolkəsmə, bir oğurluq olmazdı ki, Əmiraslanın orada əli olmamış olaydı.* S.S.Axundov. *Ətrafı kəsif bir duman bürüdü.* H.Nəzərli. *Qərənfil xala balkonda durub bir müddət kəndə, onun ətrafındakı dağlara, meşələrə baxdı.* Ə.Vəliyev.

5. *Sif. mənasında.* Yaxın, bir şeyin yaxınında olan. *Ətraf kəndlər. Ətraf evlər. Ətraf yerlər. – Orada ətraf şəhərlərdən az-maz yeni xəbərlər eşitmək mümkün olurdu.* H.Nəzərli.

6. **Ətrafında** şəklində – …xüsusunda, ...dair. *Məsələ ətrafında xeyli mübahisə getdi. Mövzu ətrafında müzakirələr oldu.*

**ƏTRAFLI** *sif.* Müfəssəl, hərtərəfli, təfsilatlı, geniş. *Ətraflı məktub. Ətraflı izahat.* // Zərf mənasında. *Ətraflı məlumat vermək. Ətraflı şərh etmək. – Müdir klinikanın məsələlərindən ətraflı danışdı.* Ə.Vəliyev.

**ƏTRAFLICA** *zərf* Çox ətraflı. *Lakin bu xüsusda ətraflıca düşünmək lazım idi.* T.Ş.Simurq. *Hər kəs ətraflıca mülahizə olunmuş müəyyən bir fikir ilə gəlsin.* Ü.Hacıbəyov.

**ƏTRAK** *is.* [*ər.* “türk” söz. cəmi] *klas.* Türk elləri, türk tayfaları, türk ölkələri. *“Leyli-Məcnun” əcəmdə çoxdur; Ətrakdə ol fəsanə yoxdur.* Füzuli.

**ƏTRƏNGİ** *sif.* Ət rəngində olan. *Ətrəngi corab.*

**ƏTRİYYAT** *is.* [*ər.* “ətr” söz. cəmi] Ətirli maddələr, ətirlər. *Ətriyyat mallarına ətirlər, odekolonlar, xoşiyli sular və qeyriləri daxildir. Ətriyyat istehsalı. – Sona ətriyyat mağazasına keçib iki balaca şüşə ətir aldı.* Mir Cəlal.

**ƏTSİZ** *sif.* 1. Arıq, əti az. *Ətsiz qoyun.*

2. Ətdə bişməmiş, əti olmayan. *Ətsiz xingal. Ətsiz xəmiraşı. Ətsiz şorba. Ətsiz xörək.*

**ƏTSİZLƏMƏ** “Ətsizləmək”dən *f.is.*

**ƏTSİZLƏMƏK** *f.* 1. Arıqlamaq, ətini tökmək. *Qışda qoyunlar ətsizləşir.*

2. *dan.* Ürəyi ət, ətli xörək istəmək. *Axır vaxtlar lap ətsizləmişəm.*

**ƏTSİZLİK** *is.* 1. Arıqlıq.

2. Ət olmaması, ət qıtlığı.

3. Xörəkdə ət olmaması.

**ƏTSUYU** *is. aşp.* 1. Əti qaynadıqdan sonra hasil olan yağlı və qidalı su; bulyon.

2. Bozbaş.

**ƏTTAR** *is.* [*ər.*] *köhn.* 1. Ətirli şeylər, ədəvat və s. satan adam. *Elm və maarif.. hamının arasında yayılmalıdır, çoban da, əkinçi də, tacir də, əttar da nazirlərin əlində olan iqtidara malik olmalıdırlar.* M.F.Axundzadə. ◻ **Əttar dükanı** – bu cür şeylərin satıldığı dükan. *Sinəm əttar dükanı; Hər nə desən, var məndə.* (Bayatı). *Molla Qasımın dükanına universal adı versək səhv etmərik, çünki bu dükanda əttar, baqqal, bəzzaz, davacat və qeyri ticarət şeyləri var idi.* S.S.Axundov.

2. Keçmişdə bitkilərdən və s.-dən dərman hazırlayıb satan adam. *Gülün gülabını axır gün çəkər əttar; Qalır sənə bu əvəz ahü zar, ey bülbül!* S.Ə.Şirvani. *Birdən Kərbəlayı Rzanın yadına düşdü ki, əttar Məşədi Hüseyn gərək çox dərs oxumuş adam ola.* C.Məmmədquluzadə.

**ƏTTARLIQ** *is. köhn.* Əttarın işi, sənəti, peşəsi. *Əttarlıq etmək.* – [Mirzə Turab:] *..Amma* [İsmayıl bəyin] *nə həkimlikdən başı çıxır, nə də əttarlıqdan.* B.Talıblı.

**ƏTTÖVBƏ** *is.* [*ər.*] Etdiyi əməlindən peşman olub tövbə etmə, bir daha etməyəcəyinə söz vermə. *Tövbə, əttövbə, xəta rahinə getdiklərimə; Bilib etdiklərimə, bilməyib etdiklərimə.* M.Ə.Sabir.

**ƏTÜRPƏRDƏN** *sif.* Çox ağır təsir edən, insanda dəhşət oyadan. *Hanı o buzlu Sibirə doğru uzanan boz geyimli dustaqların ətürpərdən qandal səsləri?* M.Hüseyn. *Leyladan ətürpərdən bir səs çıxdı: – Bu ola bilməz! Müalicə zamanı həkimin qəlbində özgə hiss baş qaldıra bilməz!* B.Bayramov.

**ƏTÜRPƏRDİCİ** b a x **ətürpərdən**.

**ƏTVAR** *is.* [*ər.* “tövr” söz. cəmi] Davranış, adamlarla münasibət. *Cəhd eylə, sən ancaq nəzəri-xalqda pak ol; Məxluqu inandır; Xasiyyətin od olsa da, ətvarda xak ol; Sök, aləmi yandır.* M.Ə.Sabir. *Bahadırın gözəl əxlaq və ətvarına görə yoldaşları onu çox sevirdilər.* N.Nərimanov. [Çadırçı usta:] *Buna bax, halına, ətvarına bax; Sanki zəncirini qırmış dustaq.* H.Cavid.

**ƏT-YAĞ** *top. dan.* Ət və yağ. *Qara çınqılın köbəsində qalanmış ocaqlardan gur tüstü qalxır, .. ət-yağ ətri ətrafı bürüyürdü.* Ə.Vəliyev. ◻ **Ət-yağ içində böyümək** – gen-bolluqla, rifah içərisində böyümək, hər cəhətdən təmin olunmaq.

**ƏTYEMƏZ** *sif.* Ət yeməyən, kəsilmiş heyvan ətini yeməyən.

**ƏTYEYƏN** *sif.* Ətlə qidalanan.

**ƏVAXİR** *is.* [*ər.* “axir” söz. cəmi] *klas.* Axır, son vaxtlar.

**ƏVAXİRDƏ** *zərf klas.* Axırda. *Münəccimbaşıya əvaxirdə bu bəhsi varid edirdilər, cavab verirdi.* M.F.Axundzadə.

**ƏVAXİRİNDƏ** *zərf klas.* Axırlarında. *Haman ilin yaz fəslinin əvaxirində, elə yadımdadır ki, may ayının axırı idi.* C.Məmmədquluzadə.

**ƏVAM** [*ər.*] b a x **avam.** [Məmmədağa:] *Əvam da var, əvam da... Amma bunlar kimi əvam mən görməmişəm.* N.Nərimanov. [Əxistan:] *Əvam camaatı aldatmaq üçün; Bəzi tədbirlərə əl atmalıyam.* M.Rahim.

**ƏVAMLIQ** b a x **avamlıq.**

**ƏVAMÜNNAS** *is.* [*ər.*] *köhn.* Avam qara camaat. *Ədəbdən, elmdən gər feyzyab olsa əvamünnas; Düşər şənü şərəfdən, mollalar, işanlar, insanlar!* M.Ə.Sabir. [Hacı Rəsul:] *İndi budur, bir para .. əvamünnas deyir: – Yox, ünas tayfasına oxumaq caiz deyil.* Mir Cəlal.

**ƏVAYİL** *zərf* [*ər.* "əvvəl" söz. cəmi] *klas.* Əvvəllər, ilk vaxtlar. [Molla Həmid:] *Sən iki pudu dəxi misin tortasına-zadına çıx, gələn ayın əvayilində otuz pud gümüş mövcuddur.* M.F.Axundzadə. *..Ortancı əsrlərin əvayilində məşhur filosof Demokrit birinci dəfə olaraq söylədi..* C.Məmmədquluzadə.

**ƏVƏLİK** *is. bot.* Xalq təbabətində işlənən, habelə qurudulmuş yarpaqları aşa qatılan, enliyarpaq, birillik ot bitkisi. *Acı əvəlik. Şirin əvəlik. – ..Qızlar əvəlik, boymadərən, qaymaqotu dərirlər.* Ə.Vəliyev.

**ƏVƏLİKÇİLOV** *is.* Əvəlik qatılmış düyüdən bişirilən çilov. *Əvəlikçilovu qatıqla yeyirlər.*

**ƏVƏLİKLİ** *sif.* Əvəlik qatılaraq bişirilmiş. *Əvəlikli çilov* (*aş*).

**ƏVƏLİKPLOV** *is.* Əvəlik qatılmış düyüdən bişirilən plov.

**ƏVƏT** *əd.* [*türk.*] Təsdiq bildirir – bəli, hə. *Baxdım ki, əzim bir cəmaət; Eyzən ürəfa, əvət, həqiqət.* M.Ə.Sabir. [Rauf:] *Əvət, şaşqınlar daim əsəbi və bədbin olurlar.* H.Cavid.

**ƏVƏZ** *is.* [*ər.*] 1. Qarşılıq, bir şeyin (adamın) yerini tuta bilən şey (adam). *Bu şeyin əvəzi yoxdur. Onun əvəzini tapmaq çətindir.* ☐ **Əvəz etmək (eləmək)** – 1) yerini tuta bilmək. *Belə bir zamanda Müqim bəy hansı bir hünərlə zabitəli xanımı əvəz edə bilərdi?* S.Rəhimov; 2) ardınca gəlmək, yerini tutmaq. *Çiskinli və qaranlıq gecəni aydın bir səhər əvəz etdi.* M.İbrahimov. *Bəzən ən soyuq günü ən isti gün əvəz edir.* Mir Cəlal; 3) dəyişdirmək. *Növbətçini əvəz etmək;* // müvəqqəti olaraq yerini tutmaq, vəzifəsini icra etmək. *Müdiri kim əvəz edir? Uzun müddət o, rəisi əvəz etdi.* // Tay, bərabər. *Gözəllikdə sənin əvəzin hanı?* (Nağıl). ☐ **Əvəz olmaq** – bərabər olmaq, uyğun olmaq. *Mən müqəddəs ata-ana sözünə; Tapmadım bir əvəz olan kəlmə.* A.Səhhət. *Əkbərin nə yalvarması, .. nə vədi Əli paşanın bir qəpiyinə əvəz ola bilmədi.* Mir Cəlal.

2. Qarşılıq, mükafat, muzd, haqq. *Zəhmətinin əvəzini aldı. – Gülün gülabını axır günü çəkər əttar; Qalır sənə əvəz ahü zar, ey bülbül!* S.Ə.Şirvani.

3. Qisas, intiqam, öc. ☐ **Əvəz(ini) almaq** – intiqam(ını) almaq, qisas(ını) almaq. **Əvəz(ini) çıxmaq** – b a x **əvəz(ini) almaq**. *Mən öz quşlarımın əvəzini çıxmaqla mükafatımı aldım, – dedim.* M.Rzaquluzadə.

4. Yerlik halda: **əvəzində** – 1) bir şeyin və ya şəxsin yerinə, yerində. *Əvəzində buların çayçı, çaxırçı dükanı; Gecə-gündüz doludur cümlə müsəlman, mənə nə!* M.Ə.Sabir; 2) qarşılıq olaraq, mükafat olaraq, müqabilində. *Qulluğumuzun və ixlasımızın əvəzində* [şah] *mənsəbimizi də əlimizdən aldı.* M.F.Axundzadə.

5. Çıxışlıq halda: **əvəzindən** – əvəz olaraq, yerinə, əvəzində. [Qurban Molla Fərzəliyə:] *Yaz ki, Anaxanımın, Məmişin gözlərindən mənim əvəzimdən öpsün və onlardan göz-qulaq olsun.* A.Şaiq.

6. Yönlük halda: **əvəzinə** – b a x **əvəzində**. [Koroğlu] *elə qəzəblə ata sıçradı ki, Qıratın əvəzinə ayrı bir at olsaydı, çoxdan beli sınmışdı.* "Koroğlu". *O yerdə ki bir lüğət kitabında gərək yazılaydı "millət", orada "millət" əvəzinə yazılıb "şəxs".* C.Məmmədquluzadə. [Kişi] *.."indi" əvəzinə "şimdi", "cənab" əvəzinə "əfəndi", "necə" əvəzinə "nasıl" qəbul etmişdi.* B.Talıblı.

**ƏVƏZÇİ** *sif.* və *is.* 1. Eyni zamanda bir neçə yerdə işləyən, bir neçə vəzifə tutan (şəxs). *Əvəzçi işçi. Əvəzçi müəllim. O, bizim idarədə əvəzçidir.*

2. İntiqamçı, əvəz çıxarmağa çalışan adam.

**ƏVƏZÇİLİK** *is.* 1. Eyni zamanda bir neçə vəzifə aparma, eyni zamanda bir neçə yerdə qulluq etmə. *Əvəzçilik işin keyfiyyətinə ziyan vurur. Əvəzçiliklə mübarizə.*

2. İntiqamçılıq, əvəz çıxmağa çalışma.

**ƏVƏZEDİCİ** *is.* Bir şeyi əvəz edən, onun əvəzində işlənən şey. *Qan əvəzediciləri.* // Sif. mənasında. *Əvəzedici maddə. Əvəzedici element.*

**ƏVƏZEDİCİLİK** *is.* Əvəzetmə, əvəz edə bilmə.

**ƏVƏZEDİLMƏZ** *sif.* Heç bir şeylə, heç bir başqa adamla əvəz edilə bilməyən, əvəzi tapıla bilməyən, əvəzi olmayan, çox qiymətli. *Əvəzedilməz işçi. Əvəzedilməz mütəxəssis.*

**ƏVƏZEDİLMƏZLİK** *is.* Əvəzedilməz şeyin vəziyyəti, halı, xüsusiyyəti.

**ƏVƏZETMƏ** *is.* 1. Əvəzləmə.

2. *kim.* Birləşmə və ünsürlərin qarşılıqlı təsiri ilə yeni birləşmə və ünsürlər alınan kimyəvi reaksiya. *Əvəzetmə reaksiyası.*

**əvəz-əvəz** *zərf* Bir şeyin əvəzində, qarşılıq olaraq.

**ƏVƏZLƏMƏ** "Əvəzləmək"dən *f.is.*

**ƏVƏZLƏMƏK** *f.* Bir şey verib əvəzində başqasını almaq. // Bir şeyi başqası ilə əvəz etmək.

**ƏVƏZLƏNDİRİLMƏ** "Əvəzləndirilmək"dən *f.is.*

**ƏVƏZLƏNDİRİLMƏK** *məch.* Başqası ilə əvəz edilmək, əvəz olunmaq.

**ƏVƏZLƏNDİRMƏ** "Əvəzləndirmək"dən *f.is.*

**ƏVƏZLƏNDİRMƏK** bax **əvəzləmək**.

**ƏVƏZLƏNMƏ** "Əvəzlənmək"dən *f.is.*

**ƏVƏZLƏNMƏK** *məch.* Başqası tərəfindən əvəz edilmək, əvəz olunmaq.

**ƏVƏZLƏYİCİ** *is. xüs.* Bir neçə qüvvəni əvəz edən qüvvə.

**ƏVƏZLİK** *is.* 1. Əvəz olaraq verilən şey, qarşılıq.

2. *qram.* İsimdən, sifətdən, saydan fərqli olaraq öz-özlüyündə müəyyən bir şeyi, yaxud keyfiyyəti ifadə etməyən, lakin nitqdən asılı olaraq belə bir məna kəsb edən söz – nitq hissəsi. *Şəxs əvəzliyi. Sual əvəzliyi.*

**ƏVƏZOLUNMA** *is.* Əvəzlənmə.

**ƏVƏZOLUNMAZ** bax **əvəzedilməz**. *Ağuz südü təzə doğulmuş qulun üçün əvəzolunmaz qiymətli qidadır.*

**ƏVƏZOLUNMAZLIQ** *is.* Əvəz oluna bilməmə, əvəzi olmama.

**ƏVƏZSİZ** *sif.* 1. Əvəzi olmayan, əvəz oluna bilməyən, başqası ilə əvəz edilə bilməyən. *Əvəzsiz yoldaş. – ..Bünyadın dostu da özü kimi Mollayevi əvəzsiz bir şəxsiyyət sayanlardandı.* M.Hüseyn. Zahid [Rübabənin] *həmişəlik və əvəzsiz munisi olmuşdu.* Mir Cəlal.

2. Misli-bərabəri, tayı olmayan. *Əvəzsiz gözəl. – Hiss olunurdu ki, Cavahir əvəzsiz çalışqan imiş.* T.Ş.Simurq.

3. *zərf* Pulsuz, müftə, qarşılıqsız. *Bəndalı xəyalına gətirə bilməzdi ki, adam adama əvəzsiz, pulsuz bir xeyir iş görə.* Mir Cəlal.

**ƏVVƏL** *zərf* [*ər.*] 1. İlk dəfə, birinci dəfə. [Dərviş:] *Ruqiyyə əvvəl babasına yaxın düşə bilmirdi.* A.Divanbəyoğlu.

2. *İs. mənasında.* Başlanğıc, ibtida. *İşin əvvəli çətindir. Kitabın əvvəli. Əsrimizin əvvəli. // Qoş. mənasında.* Qabaq. *İnqilabdan əvvəl. Soyuqlar düşməzdən əvvəl.*

3. Əvvəlcə, qabaqca. *Əvvəl sən gəl. Əvvəl fikirləş, sonra danış. Bilmirəm, hansı işdən əvvəl başlayım.*

4. Qabaqlarda, əvvəllərdə, ilk vaxtlarda, keçmişdə (bu mənada çox vaxt "əvvəllər" və "əvvəlləri" şəklində işlənir). *Əvvəl*(*lər*) *xəttim yaxşı idi, sonralar korlandı. Əvvəllər gözəl səsi var idi. Əvvəllər burada karvansara yerləşirdi. Əvvəllər biz çox yaxın idik.*

5. Zaman etibarilə daha qabaq, daha irəli, daha birinci. *Mən səndən əvvəl gəldim. Üç il bundan əvvəl olmuş hadisə. O məndən əvvəl işə başladı. Vaxtından əvvəl gəlmək. Mübahisəni kim əvvəl başladı? – İki sənə əvvəl, böylə məşum qara günü kim xatırlardı?* H.Cavid. *Ülfət toy adı eşidib əvvəl tutuldu.* Mir Cəlal. *Bir az əvvəl ildırımlı gecələri andıran o gözlər bu odlu göz yaşlarında təlatümə gəlmiş bir dəniz kimi qaynadı.* Ə.Məmmədxanlı.

6. Yer etibarilə qabaq, irəli. *O məndən əvvəldir.*

7. Bax **əvvəla.** [Dedim:] *Sara bibi, əvvəl budur ki, Ağamalıoğluna verilən ərizə gərək latın əlifbası ilə yazılsın.* Qantəmir.

◊ **Əvvəl əldə** – əvvəlcə, birinci növbədə.

**əvvəl-əvvəl** *zərf* Əvvəlcə, qabaqca.

**ƏVVƏLA** *ara s.* [*ər.*] Birincisi, birinci olaraq, ən əvvəl. [Nəcəf bəy:] *Qəhrəman bəyin, əvvəla, pulu yoxdur.* Ə.Haqverdiyev. [Ömər:] *Əvvəla, qızı görməmişəm və ondan savayı, qız on, ya on bir yaşında. Məgər bu sində qızı almaqmı olar?* N.Nərimanov.

**ƏVVƏL-AXIR** *zərf* Gec-tez. *Bilirdim ki, əvvəl-axır başıma; Gətirəcək qalmaqalı*

*gözlərin.* Q.Zakir. [Əsgər:] *Əvvəl-axır çötkə gələcəkdir.* N.Vəzirov.

**ƏVVƏLCƏ** *zərf* 1. Qabaqca, ilk öncə, daha əvvəl. *Əvvəlcə sədr iclası açdı, sonra məruzəçiyə söz verdi.* – [Eldar] *əvvəlcə nədənsə yenə bu söhbəti sabaha qoymaq istədi.* M.Rzaquluzadə. // Daha əvvəl, birinci iş olaraq. *Köhnə ağacı əvvəlcə dibindən kəsdilər, sonra sürütləyə-sürütləyə apardılar.*

2. Başlanğıcda, ibtidada. *Əvvəlcə iş adama ağır görünər.*

3. Başlamadan qabaq, qabaqca. *Əvvəlcə fikirləş, sonra danış. Əvvəlcə yaxşı qulaq as, sonra etiraz et.* – [Süleyman:] *Hələ indi, əvvəlcə bir Əsgəri evləndirək, görünür ki, bu, çox tələsiyir.* Ü.Hacıbəyov.

**ƏVVƏLCƏDƏN** *zərf* Qabaqcadan, əvvəldən. *Əvvəlcədən tədarük görmək. Əvvəlcədən şərtləşmək. – Bunlar hamısı əvvəlcədən hazırlanmış oyundur.* M.İbrahimov. *Gileygüzarov əvvəlcədən qonaqların siyahısını tutar..* S.Rüstəm.

**ƏVVƏLDƏN** *zərf* Qabaqdan, lap irəlidən, əvvəl vaxtdan, ilk vaxtdan, ibtidadan. *Mən bunu əvvəldən bilirdim. Şərti əvvəldən demək lazım idi. – Hər kim əvvəldən inanmış hər nəyə; Bir də ram olmaz o, digər bir şeyə.* H.Cavid. *Hər qəbir dünyanın bağrında yükdür; Əvvəldən torpağın dərdi böyükdür.* M.Rahim. ☐ **Əvvəldən-axıra kimi, əvvəldən-axırına kimi** – başdan-başa, hamısı, bütün. *Əvvəldən-axıra kimi yalandır.*

**ƏVVƏLƏN** [*ər.*] bax **əvvəla**. *Əvvələn, biz onu tanımırıq, ikincisi... Əvvələn, o bizim dediklərimizlə razı olmaz, sonra isə... – Əvvələn, ümdeyi-mətləb bu ki, şəhr əhli tamam; Tənbəlü kahilü bihimmətü nadan, mənə nə?!* M.Ə.Sabir. *Əvvələn, yüngül tənbehlərin hamısı manifestə düşür.* C.Məmmədquluzadə.

**ƏVVƏLİNCİ** bax **birinci.** *Əvvəlinci sıra. Əvvəlinci övlad. Əvvəlinci yeri tutmaq. Əvvəlinci rolları oynamaq.* – [Nazlı:] *Doğrudur, bir neçə adam bilir ki, Yusif ilə sən əvvəlinci dəfə görüşməyirsən.* N.Nərimanov. *Birdən uzunboylu müsafir, əlində bir çamadan vaqonların birisindən aşağı düşüb, əvvəlinci klas tərəfə qədəm qoydu.* S.M.Qənizadə. [İskəndər bəy:] *..O hər kimə nəsib olsa, yəqin bil ki, dünya üzündə əvvəlinci xoşbəxt olar.* N.Vəzirov.

**ƏVVƏLKİ** *sif.* 1. Yer, sıra, zaman, say və s. etibarilə – birinci. *Şəkildə sağdan əvvəlki adam. Əvvəlki müzakirə daha canlı keçdi.*

2. Bundan qabaqkı, bundan əvvəl olmuş, keçmişdə olan, keçmiş. *Əvvəlki hadisələrin izləri. Əsərin əvvəlki variantı. Əvvəlki adətlər get-gedə aradan qalxır. – Lakin Nurəddin .. əvvəlki halına düşmədi.* S.S.Axundov. *Zahirən evdə heç şey dəyişməmişdi, əvvəlki səliqə, əvvəlki qayda, əvvəlki münasibətlər davam edirdi.* M.İbrahimov.

3. *İs. mənasında.* Keçmişdə, daha əvvəl olan, keçmişə aid olan şey, hadisə, hal. *Əvvəlki daha yaxşı idi. Əvvəlkindən heç olmaz.* – [Dərviş:] *Qoca kişi əvvəlkindən indi diqqət ilə mənə baxıb, məndən xoylanan kimi oldu.* A.Divanbəyoğlu.

**ƏVVƏLLƏR** *zərf* 1. İlk zamanlar, ilk çağda, ibtida. *Əvvəllər işdən çox qorxurdum.* // *İs. mənasında.* İlk günlər, başlanğıc, ibtida. *Dərs ilinin əvvəlləri. XX əsrin əvvəlləri.*

2. Keçmişdə, keçmiş zamanda. *Əvvəllər onun gözəl səsi var idi. Əvvəllər hafizəm çox yaxşı idi.*

3. Daha qabaq, daha əvvəl, çox qabaq, çoxdan. *O, ədəbiyyat sahəsində fəaliyyətə daha əvvəllər başlamışdır.*

**ƏVVƏLLƏRDƏ** bax **əvvəllər.** *Əvvəllərdə bizə çox gələrdi. O, əvvəllərdə də çox arıq idi. – Zeynal əvvəllərdə Mehribanı sevirdi.* S.Hüseyn.

**ƏVVƏLLƏRİ** bax **əvvəllər** 1 və 2-ci mənalarda. *..Əvvəlləri Məşədi Molla Həsən kitab satardı.* C.Məmmədquluzadə. [Cəmil bəy] *əvvəlləri azacıq yorğun kimi idi.* H.Cavid. *Mart ayının əvvəlləri idi.* Ə.Vəliyev.

**ƏYAL** *is.* [*ər.*] *köhn.* 1. Ailə, külfət. [Yusif Sərrac] *öz kəsbi ilə özünü və əyalını saxlamağa məşğul oldu.* M.F.Axundzadə. *İndi əgərçi ona zəhmət olar; Qışda əyalı, özü rahət bular.* M.Ə.Sabir. *Para nədir? Üzünü gördüyüm bir il yoxdur; Fəqət əyal yanında xəcalətim çoxdur.* Ə.Nəzmi.

2. Arvad, zövcə. *Bəs nədir yığıbsan neçə əyalı; Doğmaz şad olarsan, doğar ağlarsan.* M.V.Vidadi. [Qoca kişi:] *Budur, neçə gün olar ki, özümə bir əyal gətirmişəm.* Ə.Haqverdiyev. *Sonra bir tikə yavan çörək də tapsam, əyalım ilə qabaq-qabağa əyləşib ağız ləzzəti ilə, iştaha ilə yeyərəm.* Mir Cəlal.

**ƏYALƏT** *is.* [*ər.*] 1. *tar.* Bir valinin idarəsi altında olan ölkə. *Həmədan ilə Bağdad, Həmədan ilə İraq, Xarəzm, Rey və Fars əyalətləri arasında şiddətli danışıqlar və alış-verişlər gedirdi.* M.S.Ordubadi.

2. Bəzi dövlətlərdə: ölkənin bölündüyü inzibati rayonların hər biri; vilayət, mahal. *1918-ci ilin yaz və yay fəsillərini İranın Gilan əyalətində keçirmişdim.* S.Hüseyn. *Səttarxan dövründə təşkil olunmuş əyalət əncümənləri müəyyən hüquqlara malik olan muxtar dövlət üsulundan başqa bir şey deyildi.* M.İbrahimov. *Xəmsə əyalətinin mərkəzi Zəncan Azərbaycanın mühüm şəhərlərindən biridir.* P.Makulu.

3. İri mərkəzlərdən uzaq olan yer. // Ümumiyyətlə, ölkənin paytaxtdan, mərkəzdən uzaq olan ərazisi. *Nəhayət, əyalətdə işləyən görkəmli bir vücud xanım Süsəni götürüb Tehrana apardı.* M.İbrahimov.

**ƏYAN¹** *sif.* [*ər.*] Gözlə görünən, açıq, aydın, aşkar (adətən xəbər şəkilçisi ilə işlənir). *Onun düzgünlüyü hamıya əyandır. – Gedən, getmə, dayan, dur; Sirrim sənə əyandır.* (Bayatı). *Sənə əyandır, ey dilbər, sevdiyim! Qurbanidir, bir şey dilər, sevdiyim!* Qurbani. ☐ **Əyan etmək (eləmək)** – aydın etmək, bildirmək. *Yox bir açıq dilim, sənə mən eyləyim əyan; Ta sən qanınca, qalmayacaq millətimdə can.* Ə.Qəmküsar. *Qurban bu xəbəri gəlib xanımına əyan elədi.* İ.Musabəyov. **Əyan olmaq** – bəlli olmaq, aşkar olmaq, aydın olmaq. *Cənnətin yavıqlaşmağı ustaya əyan oldu.* Çəmənzəminli.

**ƏYAN²** *top.* [*ər.*] *köhn.* Keçmişdə: ölkənin yuxarı təbəqələrinə mənsub olan mötəbər və yaşlı adamlar; zadəganlar. *Nüşabə taxt üstündə oturmuş, ətrafda vəzirlər, əyanlar, sərkərdələr, saray adamları dayanmışdır.* A.Şaiq. *Ordunu yola salmaq üçün Gəncənin əyan və ziyalıları İsfahan kəndinə qədər gəlmişdi.* M.S.Ordubadi. *Papaqların bəzisi uzun və qovun çeşnisində idi, bunların sahibinin molla və əyandan olmağı aşkar idi.* Çəmənzəminli.

**ƏYANİ** *sif.* [*ər.*] 1. Açıq, aşkar, gözlə görünən, göz qabağında olan, tamamilə aydın, inandırıcı. *Əyani misal. Əyani sübut, dəlil.* // Zərf mənasında. *Deyilənləri əyani göstərmək.*

2. *ped.* Məktəbdə öyrənilən fənlərə dair material və modelləri tələbələrə bilavasitə göstərmək əsasında qurulmuş və buna xidmət edən. *Əyani tədris.* ☐ **Əyani təhsil** – qiyabi təhsildən fərqli olaraq, məktəbdə dərs və məşğələlərə müntəzəm surətdə davametmə yolu ilə təhsil alma üsulu.

**ƏYANİLİK** *is.* 1. Əyani şeyin halı; əyani olma. *Təbiyyat dərslərində əyanilik əsas şərtdir.*

2. Göz önündə olma, aşkarlıq, aydınlıq, inandırıcılıq.

**ƏYANLIQ** *is.* Əyan rütbəsi.

**ƏYAR** is. [*ər.*] 1. Qiymətli metalın saflıq və xalislik dərəcəsi. *Üzüyün əyarı. Qızıl pulun əyarı.*

2. Düzgünlük, dəqiqlik.

**ƏYARQABI** *is.* Bəzi maddələrin miqdarını müəyyən etmək üçün ölçü qabı. *Bizim kəndlilərin hər birinin evində bir əyarqabı olar ki, onun içinin nə qədər yağ tutması birdəfəlik müəyyən edilir.* Ə.Haqverdiyev.

**ƏYDƏM** *is.* Əyrilik, bir yeri əyri olan şey.

**ƏYDƏMLİ** *sif.* Bir yerində əyrilik olan.

**ƏYDİRMƏ** "Əydirmək"dən *f.is.*

**ƏYDİRMƏK** "Əymək"dən *icb. Budağı əydirmək.*

**ƏYƏ¹** bax **adə**. [Kürd Musa:] *Murad! Əyə, .. sənin yaxşı səsin var; Onun sözlərindən bir oxu, barı!* S.Vurğun. [Koxa:] *Əyə, uşaq-uşaq danışma, ballı xəşildən səni buraxdı yoxdur, – dedi.* S.Rəhimov.

**ƏYƏ²** *is. xüs.* Əyələmək üçün işlədilən polad alət; suvand.

**ƏYƏ³** *is. mif. məh.* Hami ruh.

**ƏYƏLƏMƏ** "Əyələmək"dən *f.is.*

**ƏYƏLƏMƏK** *f.* Metalın üzərindən müəyyən qatı əyə ilə sürtüb götürməklə ona dəqiq ölçü vermək və hamarlamaq; suvandlamaq.

**ƏYƏLƏNMƏ** "Əyələnmək"dən *f.is.*

**ƏYƏLƏNMƏK** *məch.* Əyə ilə sürtülmək; suvandlanmaq.

**ƏYİLMƏ** "Əyilmək"dən *f.is.*

**ƏYİLMƏK** *f.* 1. Əyri hala düşmək. *Dəmir əyildi. Məftil əyilib.*

2. Təzyiq, ağırlıq altında aşağıya doğru meyil etmək; sallanmaq. *Ağacın budaqları əyilib. – Ev köhnə evə oxşayır. Çünki tirlərin çoxusu əyilibdir.* C.Məmmədquluzadə.

3. Belini əymək, aşağı qatlanmaq. *Əyilib daşı yerdən qaldırdı. – Südabə əyilib* [anasının] *alnından öpərək çəkilib getdi.* M.İbrahimov. *Əyilib yeri nə qədər diqqətlə yoxladımsa da, heç bir iz görmədim.* M.Rzaquluzadə.

4. *məc.* Sitayiş etmək, səcdə etmək, baş əymək. [Şeyx Sənan:] *Gəlməz əldən əyilməmək.. Əlbət; Səndə var çünki başqa ülviyyət.* H.Cavid. *Ey gənc! Səadəti bir xəyal bilmə; Nə olursa olsun, ancaq əyilmə!* S.Vurğun. [Leyla:] *De ki, üz döndərib məhəbbətimdən; Ucuz şöhrətlərə əyilmərəm mən!* B.Vahabzadə.

5. *məc.* İncimək, küsmək. *Nə deməkdir dost dostundan əyilmək?* M.P.Vaqif.

6. Etina etmək, meyil göstərmək, fikir vermək. *Gözlərini bir kərə silməzdi el; Qəzetəyə, jurnala əyilməzdi el..* M.Ə.Sabir.

7. Batmağa doğru meyil etmək (Günəş haqqında). *Dağ başını qar alar; Gün əyilər, saralar; İgid ölər, ad qoyar; Müxənnətdən nə qalar?* (Bayatı). *O gün axşamüstü günəş üfüqə doğru əyilmiş, kölgələr uzanmağa başlamışdı.* S.Hüseyn. *Gün əyiləndən sonra sahənin üzərində dəstə-dəstə dolaşa uçuşurdu.* İ.Hüseynov. *Şahmar evlərinə çatanda gün lap əyilmişdi.* B.Bayramov.

**ƏYİLTMƏ** "Əyiltmək"dən *f.is.*

**ƏYİLTMƏK** *f.* Əyri etmək, əyri hala salmaq.

**ƏYİN** *is.* 1. Bədənin başdan qeyri bütün hissəsi. *Əyninə yeni kostyum geymişdir. Əynində heç bir şey yoxdur* (çılpaqdır). – *Əynində donu yox, başına papaq axtarır.* (Ata. sözü). *Həyətin sol tərəfindən Vəliqulu, əynində cındır gödək arxalıq və başında köhnə boz papaq, kürəklə peyin sərirdi.* C.Məmmədquluzadə. *Əynindəki həmişəlik iş paltarından başqa bircə dəst bayır-bacaq paltarı var idi.* H.Nəzərli.

2. Paltar, üst-baş. *Əyni köhnədir.* – [İkinci kəndli:] *Boğazımdan kəsmişəm, əynimdən kəsmişəm, vur-tut* [*Bakıdan*] *üç yüz manat pul gətirmişəm.* C.Cabbarlı. *..Çimnaz arvad əynini dəyişmək lazım olduğunu təkrar* [Nazlının] *yadına saldı.* Ə.Əbülhəsən.

◊ **Əyninə biçilmək** – düz gəlmək, tamamilə münasib olmaq (paltar haqqında). [Qoltuqçu:] *Elə bil ki, tamamən əyninə biçilibdir, – deyə tərifə başladı..* S.Rəhimov. **Əyninə çəkmək** – geymək.

**ƏYİN-BAŞ** *is.* Paltar, üst-baş. *Özünə bir yaxşı əyin-baş düzəltdi.* – [Hafizə xanım:] *Əynin-başın bir az düzəlibdir, elə bilirsən bir şeysən?* Ə.Haqverdiyev. *Bir iyirmi manat da uşaqların və Mehribanın əyin-başı götürər.* S.Hüseyn. *Mən dedim*: – *Üşüyərsən! Sən dedin*: – *Əynim-başım istidir.* R.Rza.

**ƏYİNDİRİK** *is. dan.* Köynəyin arxasına salınan astar. *Əyindirik köynəyin tez yırtılmasına mane olur.*

**ƏYİNTİ** *is.* 1. Əyilmiş yer, əyri, bir şeyin əyilmiş hissəsi. *Borunun əyintisini düzəltmək.*

2. *məc.* Hər hansı bir işdə düzgün xəttin pozulması, səhvə yol verilməsi, zərərli ifratçılıq. *İşdə əyintiyə yol verməmək. Əyintiləri aradan qaldırmaq.*

**ƏYİRDƏK** *is.* Südlə yoğrulub yağda qızardılmış kövrək qoğal. *Camal əmi səliqə ilə iki torba əyirdək, bir torba qovurğa, bir torba iydə .. yeşiyə qabladı.* Ə.Vəliyev.

**ƏYİRDİLMƏ** "Əyirdilmək"dən *f.is.*

**ƏYİRDİLMƏK** "Əyirtmək"dən *məch.*

**ƏYİRİCİ** 1. *sif. xüs.* İplik və s. əyirən. *Əyirici sexi.*

2. *is.* İplik əyirən usta. *Qız yavaş-yavaş əyirici peşəsinə yiyələndi.*

**ƏYİRİCİLİK** *is.* Əyirmə işi, əyiricinin işi, sənəti.

**ƏYİRİLMƏ** "Əyirilmək"dən *f.is.*

**ƏYİRİLMƏK** "Əyirmək"dən *məch.*

**ƏYİRİLMİŞ** *f.sif.* Əyirilərək ip halına salınmış. [Gülsüm:] *Nə xəbər, qaçaqaç deyil ki, mənim hələ əyirilmiş yunum var.* C.Cabbarlı.

**ƏYİRMƏ** 1. "Əyirmək"dən *f.is.*

2. *sif.* Əyirilmiş. *Əyirmə yundan corab toxuyurlar.*

**ƏYİRMƏK** *f.* Əllərin arasında, yaxud müxtəlif mexanizmlər vasitəsilə yun, pambıq liflərini eşib ip halına salmaq. *Cəhrəsi qarşısında ip əyirər; Uşağıyçın belə dua eləyər.* A.Səhhət. [Tapdığın] *anası isə çoxdan bəri məfrəşdə saxladığı yunu darayır, əyirirdi.* Ə.Vəliyev. *Fatı qaşqabağını töküb*: – *Görmürsən yun darayıram? – dedi, – ip əyirəcəyəm, gəbə toxuyacağam.* Ə.Abasov.

**ƏYİRMƏÖLÇƏN** *sif. xüs.* Sapın, ipin və s.-nin eşilmə dərəcəsini müəyyən edən cihaz.

**ƏYİRTDİRMƏ** 1. "Əyirtdirmək"dən *f.is.*
2. *sif.* Əyirtdirilmiş. *Əyirtdirmə ip.*

**ƏYİRTDİRMƏK** *icb.* Əyirtmə işi gördürmək. *İp əyirtdirmək.*

**ƏYİRTMƏ** 1. "Əyirtmək"dən *f.is.*
2. *sif.* Əyirdilmiş. *Əyirtmə ipək sapı.*

**ƏYİRTMƏK** *icb.* Əyirmə işi gördürmək (başqasına). *İp əyirtmək.*

**ƏYİŞ-ÜYÜŞ: əyiş-üyüş olmaq** *dan.* – əyilmək, əyri hala düşmək. *Mollayevin .. sifəti bozarıb əyiş-üyüş oldu.* M.Hüseyn.

**ƏYLƏC** *is.* Maşını, qatarı saxlamaq mexanizmi; tormoz.

**ƏYLƏMƏ** "Əyləmək"dən *f.is.*

**ƏYLƏMƏK** *f.* Saxlamaq, dayandırmaq, durdurmaq. *Atı əyləmək. Maşını əyləmək.* – [Hatəmxan ağa:] *Göydə uçan qanadlı quşu əyləmək olarsa, Şahbazı da güclə əyləmək olar.* M.F.Axundzadə. *"Salaməleyküm" səsi məni əylədi.* A.Divanbəyoğlu. *Düz mənə tərəf gəlirdi. Üzəngimdən yapışıb əylədi.* Mir Cəlal.

**ƏYLƏNCƏ** *is.* 1. Ürəyi əyləndirəcək, könlü açacaq şey, əylənmək üçün vasitə. *Mehribanın yeganə əyləncəsi çocuqları idi.* S.Hüseyn. *Sitarənin könlü daha əyləncələr diləməzdi, fikrindən də uşaqlar ilə laqeydanə oynamaq keçmirdi.* Çəmənzəminli.

2. Faydasız, səmərəsiz, əhəmiyyətsiz şey; boş vaxt keçirmə. *Kim ki tənbəlliyə məhəbbət edər; Daim əyləncələrlə ülfət edər.* M.Ə.Sabir. *Firidun Şəmsiyyənin bir oyun, bir əyləncə düzəltdiyini güman etdi.* M.İbrahimov.

3. *məc.* Çox asan iş mənasında. *Onun üçün bu iş əyləncədir.*

4. *məc.* Oyuncaq, əylənmək üçün alət. *Xəbər olsun hər təzəyə, hər gəncə; İnsan – çocuq, həyat ona əyləncə..* M.Müşfiq. *..Sonra gördüm başqa bir aləmdəyim; Bir yığın insan üçün əyləncəyim!..* H.Cavid. *Nə erkək, nə qadın əyləncə deyil.* S.Vurğun. ☐ **Əyləncə olmaq** – başqasının bütün əmrlərinə sözsüz tabe olmaq, əlində oyuncaq olmaq. [Nüşabə:] *..Dost olsa həm Şəki, həm Aran, Gəncə; Ellərim düşmənə olmaz əyləncə.* A.Şaiq. // Əylənmək üçün alət olmaq.

**ƏYLƏNCƏLİ** *sif.* 1. Əylənib vaxt keçirmək üçün yerləri, vasitələri olan. *Əyləncəli parklar. Uşaq meydançaları uşaqlar üçün əyləncəli yerdir.*

2. Ürəkaçan, əyləndirən, məzəli, əyləndirici, maraqlı. *Əyləncəli tamaşa. Əyləncəli kitab. Əyləncəli söhbətlər.* – [Turxan bəy Marala:] *İnşallah, bir-iki ay sonra Cəmil Barjomdan gələr. Ona da bir qız nişanlarıq.. Əyləncəli bir toy məclisi quraraq.* H.Cavid. *Əsgərləri alıb qazmalara sarı yönələrkən, Cuma da əyləncəli bir tamaşadan qayıdırmış kimi gülümsəyərək uzaqlaşmaq istədikdə Kəyan əmr etdi..* Ə.Əbülhəsən.

**ƏYLƏNDİRİCİ** *f.sif.* Əyləndirmək üçün olan, əyləndirən. *Əyləndirici söhbət. Əyləndirici tamaşa. Əyləndirici oyunlar.* – *Qeyd etmək lazımdır ki, dramaturgiya tarixində .. nəşəli, əyləndirici komediyalar azdır.* Ə.Sultanlı.

**ƏYLƏNDİRİLMƏ¹** "Əyləndirilmək¹"dən *f.is.*

**ƏYLƏNDİRİLMƏ²** "Əyləndirilmək²"dən *f.is.*

**ƏYLƏNDİRİLMƏK¹** *məch.* Əyləncə ilə məşğul edilmək, başı qarışdırılmaq.

**ƏYLƏNDİRİLMƏK²** *məch.* Saxlanılmaq, dayandırılmaq, durdurulmaq.

**ƏYLƏNDİRMƏ¹** "Əyləndirmək¹"dən *f.is.*

**ƏYLƏNDİRMƏ²** "Əyləndirmək²"dən *f.is.*

**ƏYLƏNDİRMƏK¹** *f.* Əyləncə ilə məşğul etmək, başını qarışdırmaq, şənləndirmək, ürəyini açmaq. *Uşaqları cürbəcür oyunlarla əyləndirmək. Yanında bulunan qadınlar* [Gülzarı] *yayındırmaq və əyləndirmək üçün qrammofon oxudurlardı.* T.Ş.Simurq. [Həsən:] *..Rəşid əfəndi gəldi də sizi əyləndirir.* H.Nəzərli. // Oynatmaq, əyləncə etmək. *Bir könülə kifayətdir bir mənalı məhəbbət; İki qəlbi əyləndirmək xəyanətdir, sevgilim!* S.Rüstəm. [Tutu:] *Bir zaman məni də bu cür yağlı dillərlə əyləndirirdin.* Ə.Vəliyev.

**ƏYLƏNDİRMƏK²** *f.* Hərəkətdə olan bir şeyin hərəkətini saxlamaq, dayandırmaq, durdurmaq. *Gedən adamı əyləndirmək.* – *Qərəz, Gülpəri gilabısatanı əyləndirib evə qayıdar və: – Ay ana, tez ol, gəl, gilabısatan qapıdadır, – deyərdi.* H.Sarabski. [Səlim] *kəndlərinin bərabərinə çatanda maşını əyləndirdi, sərnişinlər ona kömək etdi, onu yük maşınından düşürtdülər.* S.Rəhimov.

**ƏYLƏNMƏ¹** "Əylənmək¹"dən *f.is.*

**ƏYLƏNMƏ²** "Əylənmək²"dən *f.is.*

**ƏYLƏNMƏK**[1] *f.* Dayanmaq, durmaq, yubanmaq, ləngimək. *O, görəsən, harada əyləndi, gəlib çıxmadı?* – [Dəli Həsən:] *Əylən, bir qulaq as sözə.* “Koroğlu”. *Fərhad qulluqdan çıxanda daha bir yanda əylənməyir, tez evə qayıdırdı.* C.Cabbarlı. // İlişib qalmaq, sakin olmaq. *1918-ci ildə Minkənd tərəfdən gələn Zəngəzur qaçqınlarından bu kənddə əylənənləri çox olmuşdu.* Ə.Abasov.

**ƏYLƏNMƏK**[2] *f.* 1. Ürək sıxıntısını dəf edərək xoş vaxt keçirmək, ruhən istirahət etmək üçün əyləncə ilə, əyləndirici bir şeylə məşğul olmaq, vaxt keçirmək. *Axşam yaxşıca əyləndik.* – [Xəyyam:] *Qayğı bilməz, içərək əyləniriz; Ayrı olsaq da, həqiqətdə biriz.* H.Cavid. [Zeynal] *hər zaman gülmək, əylənmək, bağırmaq, sərxoş olaraq səfahətlə vaxt keçirmək istəyirdi.* S.Hüseyn. [Xan] *..hətta özü də saatlarca Buğacla əylənib nişan atırdı.* M.Rzaquluzadə. // Oynamaq, şənlik etmək. *Uşaqlar bağçanın həyətində əylənirlər. – Sən şad ol, sən əylən, sevin, gül barı; Qoy mən ayrılığın çəkim yükünü.* R.Rza.

2. Lağa qoymaq, masqaraya qoymaq, ələ salmaq, oynatmaq. *Dükançıların bizimlə əyləndiklərini anlayaraq*: *– Bağışlayın, – dedi.* A.Şaiq. // Zarafat etmək, şuxluq etmək. *Arabir Ballı onunla əylənərək*: *– A kişi, hansı bəxtəvəri sevmisən? – deyirdi.* A.Şaiq.

**ƏYLƏŞDİRİLMƏ** “Əyləşdirilmək”dən *f.is.*

**ƏYLƏŞDİRİLMƏK** *məch.* Oturdulmaq.

**ƏYLƏŞDİRMƏ** “Əyləşdirmək”dən *f.is.*

**ƏYLƏŞDİRMƏK** *icb.* Oturtmaq. *Yanında əyləşdirmək. Qonağı başda əyləşdirdilər. – Arvadı Cavadı çarpayının üstündə əyləşdirdi.* Ə.Haqverdiyev. *Ata oğlunu sakit edib əyləşdirdi.* Mir Cəlal. *İntizamla əyləşdirdi; Reyhan bütün uşaqları.* M.Dilbazi.

**ƏYLƏŞMƏ** “Əyləşmək”dən *f.is.*

**ƏYLƏŞMƏK** *f.* Oturmaq. *Buyurun, əyləşin. Hərə öz yerində əyləşdi. – Usta Zeynal balkonda əyləşib çıxartdı çubuğunu və başladı çəkməyə.* C.Məmmədquluzadə. *Masa ətrafında dörd nəfər əyləşmişdi.* H.Nəzərli. *Qabaq cərgədə əyləşmiş Qərənfil bacı ah çəkdi.* İ.Əfəndiyev.

**ƏYLƏTMƏ** “Əylətmək[2]”dən *f.is.*

**ƏYLƏTMƏK**[1] b a x **əyləndirmək**. *Əylətmədin qəlbin əziz qonağın; Ölüncə sinəmdən çəkilməz dağın.* Molla Cümə.

**ƏYLƏTMƏK**[2] *f.* Saxlamaq, dayandırmaq, durdurmaq.

**ƏYLİK** *is.* Cüyür.

**ƏYMƏ**[1] 1. “Əymək”dən *f.is.*

2. Əyri, yay şəklində olan. [Səttar xanın] *əymə və qövsi qaşları tez-tez qalxır*(*dı*). M.S.Ordubadi.

**ƏYMƏ**[2] *is.* 1. Dişləni (əskeşi) qayışlar vasitəsilə xamuta (boyunduruğa) bənd etmək üçün istifadə edilən əyilmiş ağacdan ibarət qoşqu hissəsi. *Əymə əyir, mənfəət ilə satır; Pul qazanır, yaxşı qazanca çatır.* A.Səhhət.

2. Araba çarxının, üz tərəfdən şinlə qapalı olub pərlər keçirilən dairəsi. *Çarxın əyməsi şinsiz tez xarab olur.*

**ƏYMƏK** *f.* 1. Bir yana meyil etdirmək, aşağıya, yerə tərəf meyilləndirmək. *Ağacın budağını əymək.* – [Palıd:] *Əssə külək, qopsa da tufan yenə; Əyməyə əsla gücü çatmaz mənə.* M.Ə.Sabir. *Bu yerlərdə limon sarı; Əyir, salır budaqları.* S.Vurğun. *Kolların altında baş qaldırmış körpə bənövşələr yazıq-yazıq boynunu əyib sanki torağayların səsinə qulaq asırdı.* Ə.Vəliyev.

2. Əyri şəklə salmaq. *Məftili əymək. Kəfgirin sapını əymək. Qaşığı əymək. Uşaq çubuğu əyib özü üçün yay qayırdı.*

3. *məc.* Belini bükmək. *Mən aşıq, dərd əydi; Dərman əydi, dərd əydi; Dərmana gedən təbib; Gəl, xəstəni dərd əydi.* (Bayatı). *Pərişan etdin halımı; Əyibsən qəddi-dalımı.* Q.Zakir. *Atabalanı fələk əyə bilməzdi, Balakişinin ölümü kişini yay kimi əydi.* A.Şaiq.

4. *məc.* Razı salmaq, qane etmək, tabe etmək. *Onu əymək mümkün deyil.*

5. *məc.* Təhrif etmək, düz yoldan sapdırmaq, əyintiyə yol vermək.

◊ **Ağız əymək** – b a x **ağzını əymək** (“**ağız**[1]”da). **Baş əymək** – b a x **baş. Boyun əymək** – b a x **boyun. Qaşını əymək** – narazılıq ifadə etmək. [Şölə xanım:] *..Sənin kefin yaxşı olsun, niyə qaşını əyibsən?..* M.F.Axundzadə. **İşi əymək** – b a x **iş**.

**ƏYMƏLİ** *sif. dan.* Əyri, əyri olan, əyilmiş. *Əyricə qaşı var, ucu əyməli; Kətan köynək geyib, köksü düyməli.* Aşıq Kərəm.

**ƏYRƏMCƏ** *is. məh.* Arıq, sısqa, cansız. *Bu uşaq nə əyrəmcə uşaqdır?*

**ƏYRƏMLİ** *sif.* Əyri, əyri-üyrü. *Dağ atları yolu ehtiyatla, elə bil ki, hər qarışı diqqətlə yoxlaya-yoxlaya gedirlər. Belə olmasa, altı-üstü göz qaraldan, əyrəmli, nazik cığırların qurbanlarını sayıb qurtarmaq olmaz.* R.Rza.

**ƏYRİ** *sif.* 1. Düz istiqamətdə olmayan, düz xətt təşkil etməyən (*düz* ziddi). *Əyri yol. Əyri xətt. Əyri qılınc. – Cığır dolanbac yol kimi əyri idi.* M.İbrahimov. *Murad dedi*: *– Var, bala; Əyri qazma üsulu.* M.Rahim. // Düz durmayan, düz olmayan, bir yana əyilmiş. *Əyri barmaq. Əyri çənə. Əyri mismar. – Xudayar bəyin bir böyük qüsuru var. Burnu əyridi, əyridi, amma pis əyridi..* C.Məmmədquluzadə. [Qaçayın] *burnu bir qədər əyri və iri idi.* Ə.Vəliyev. // Zərf mənasında. *Əyri getmək. Mıxı əyri vurmaq. – Ümumi zəiflikdən başqa* [Cəbinin] *ayaqları da əyri bitirdi.* N.Nərimanov. ☐ **Əyri baxmaq** – 1) gözünün yan tərəfi ilə baxmaq, çəp baxmaq; 2) *məc.* Narazı, şübhəli, yaxud kinli və hiddətli baxışla baxmaq. *Axır vaxtlarda nədənsə mənə əyri baxır.*

2. Sözündə, işində, hərəkətində düz olmayan, yalançı, fırıldaqçı. *Əyri adam bir gün özünü göstərəcək. – Əyri adamın bacarıqlı olmağı, düz adamın əfəlliyindən cəmiyyət üçün daha qorxuludur.* M.İbrahimov. ☐ **Əyri danışmaq** – düz danışmamaq, səmimi danışmamaq, hiylə işlətmək, biclik etmək. **Əyri getmək** – 1) fırıldaq, hiylə yolunu tutmaq, düz yolla getməmək; 2) aldatmaq, vəfasızlıq göstərmək. *Əzəldən arada əhdü peyman var; Əyri getmə, Əslim, yolu düz yeri!* “Aşıq Kərəm”. **Əyri görmək** – pis şəkildə görmək, xoşuna gəlməyəcək tərzdə görmək. *Niyə bəs böylə bərəldirsən, a qare, gözünü; Yoxsa bu ayinədə əyri görürsən özünü?* M.Ə.Sabir. *Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim.* M.P.Vaqif. **Əyri güzgü** – 1) əksi düzgün göstərməyən güzgü; 2) *məc.* bir şeyin təhrif olunmuş əksi. // İs. mənasında. *Casusmusan ki, yoxsa oğru? Ya əyrimisən ki, yoxsa doğru?* Xətayi. *Bir oğru, bir əyri, bir də haramı; Bu üçü bir olsa kolda gizlənər.* Xəstə Qasım. *Tənbələ, əyriyə xeyirxahlıq etmək yaxşı işləyənin belindən basmaqdır.* M.İbrahimov. // *is.* Düzgün olmayan şey. *Şairəm, çünki vəzifəm budur əşar yazım; Bədi bəd, əyrini əyri, düzü həmvar yazım.* M.Ə.Sabir. [Keykavus şah:] *Çarə bul, seçilsin doğru əyridən.* H.Cavid. [Vəzir:] *Belə olar əyyar sözü; Yanlış deyər əyri, düzü.* A.Şaiq. ☐ **Əyri iş** – fırıldaq, hiylə. *..Əyri işlərin haqqında doğru danış.* M.S.Ordubadi.

3. *is. riyaz.* Əyri xətt. *Diaqramın əyriləri. Əyrinin nöqtələri.* // Hər hansı bir prosesin kəmiyyət nisbətini göstərən (əyri xətt şəklində) qrafik təsvir. *Temperatur əyrisi. Yağıntı əyrisi.*

◊ **Əyri göz** – mövhumatçıların etiqadınca, gözü dəyə bilən adamın gözü. [Qızyetər:] *Yox... yox..., qadan alım, min əyri göz var; Bircə farağat dur, .. göz dəyər sənə.* S.Vurğun. **Əyri (gözlə) baxmaq** – qeyri-məmnun, narazı, acıqlı yaxud şübhəli nəzərlə baxmaq. *Əyri gözlə mənə baxdı.* **Əyri-əyri baxmaq** – b a x **əyri (gözlə) baxmaq.** *Sona əyri-əyri baxır Məşədi Zeynəbin üzünə və birdən onun üstünə hücum çəkib itələyir.* C.Məmmədquluzadə. *Hacı Rəsul çomaqlı kəndliyə əyri-əyri baxdı.* Mir Cəlal. *Molla Şirəlinin ən çox zəhləsi getdiyi, ona əyri-əyri baxıb salam verməyən cavanlar idi.* S.Rəhman. **Əyri oturaq (oturub), düz danışaq** – bir-birimizdən incisək də, həqiqəti olduğu kimi deyək. *Ey fələk, gəl ki, bir əyri oturub düz danışaq.* S.Ə.Şirvani. [Gəray ağa:] *Gəl burada, bu qapalı otaqda, bu İçərişəhərdə əyri oturub düz danışaq!* S.Rəhimov.

**ƏYRİAĞIZ** *sif.* Ağzı əyri olan. *Əyriağız adam.*

**ƏYRİAYAQ** *sif.* Ayaqları əyri olan. *Əyriayaq kişi.*

**ƏYRİBEL** *sif.* Beli əyilmiş, beli əyri olan. *..Gecə-gündüz karxanasının fikrini çəkən əyribel Cavadın söz istəməsi aranı sakit etdi.* Ə.Əbülhəsən.

**ƏYRİ-BƏRİ** *zərf* Ora-bura, o tərəfə-bu tərəfə. [Tələbələr] *gecə səhərə kimi yatmır, əllərini ovxalayır, əyriyə-bəriyə gedirdilər.* “Qatır Məmməd”.

**ƏYRİBOYUN** *sif.* Boynu əyri olan. *Körpə Aslanın yadına .. əyriboyun dəvə və irigöz dəvə balası düşdü.* S.Rəhimov.

**ƏYRİBÖYÜR** *sif.* Bədən quruluşu əyri, biçimsiz olan.

**ƏYRİ-BULAMAC** *sif. məh.* Çox əyri, əyri-üyrü. *Əyri-bulamac yollar. – ..Şəhərin tarixini öyrənməklə bərabər, əyri-bulamac küçələrini də tanımağa başladıq.* Ə.Əbülhəsən.

**ƏYRİBURUN** *sif.* Burnu əyri olan.

**ƏYRİBUYNUZ** *sif.* Buynuzları əyri olan. *Əyribuynuz qoç.*

**ƏYRİ-BÜYRÜ** b a x **əyri-üyrü.** *Əyri-büyrü ağac. – Yunan əlifbası girdələşə bilməyib, əyri-büyrü xətlər ilə yazılırdı.* F.Ağazadə.

**ƏYRİCƏ** *sif.* Az əyri, bir qədər əyri, yaxud çox əyri. *Qabağımıza əyricə bir yol çıxdı. Əyricə ağac.* // Qövs şəklində, yay kimi. *Əyricə qaşı var, ucu əyməli; Kətan köynək geyib, köksü düyməli.* "Əsli və Kərəm".

**ƏYRİCİZGİLİ** *sif.* Cizgiləri əyri (çəp) olan. *Əyricizgili dəftər.*

**ƏYRİÇİYİN** *sif.* Çiyni əyri olan. *Əyriçiyin adam.*

**ƏYRİDİMDİK** *sif.* Dimdiyi əyri olan. *Əyridimdik quş. – Bu, iri toyuq boyda, uzun, əyridimdik anac bir çil gülənşah idi.* M.Rzaquluzadə.

**ƏYRİ-DOLANBAC** *sif.* Əyri-üyrü, dolanbaclı, düz xətt üzrə olmayan. *Əyri-dolanbac dalan. – Darısqal, əyri-dolanbac küçələri .. bu qəsəbəni qədim şəhərlərə oxşadırdı.* Ə.Əbülhəsən.

**ƏYRİ-ƏSKİK** b a x **əgər-əskik**.

**ƏYRİXƏTLİ** *sif. riyaz.* Əyri xətlərlə düzələn. *Əyrixətli səth. Əyrixətli fiqur. Əyrixətli üçbucaq.*

**ƏYRİQIÇ** *sif.* Qıçları əyri olan. *Əyriqıç adam.*

**ƏYRİQILÇA** b a x **əyriqıç**.

**ƏYRİLİ** *sif.* Əyrisi, əyri yeri, ya yerləri olan. *Belə əyrili çubuqdan səbət toxumaq olmaz. Əyrili yol.*

**ƏYRİLİK** *is.* 1. Əyri şeyin halı. *Tirin əyriliyi. Məftilin əyriliyi.*

2. *məc.* Hiylə, biclik; düz, namuslu yolla getməmə (*düzlük* əksi). *Bir xəyanət görünməyib bizdən; Əyrilik sadir olmayıb düzdən.* S.Ə.Şirvani. *Zira ki, yalan və əyrilik həmişə aşkar olub insanı bədnam edir.* N.Nərimanov.

**ƏYRİLMƏ** "Əyrilmək"dən *f.is.*

**ƏYRİLMƏK** *məch.* Əyri hala düşmək, əyilmək.

**ƏYRİM**[1] 1. *is.* Döngə, dönüş.

2. *sif.* Əyrisi, döngəsi olan. *Əyrim yol.*

◊ **Əyrim laləvər** *bot.* – birillik iriyarpaqlı bitki. *Əyrim laləvər birillik bitkilərdəndir. Gövdələri 40 sm-ə qədər hündürlüyündədir, girdə-tinlidir, adətən budaqlanandır. Yarpaqları iridir, lələk bölümlüdür.* H.Qədirov.

**ƏYRİM**[2] *sif. məh.* Sısqa. *Əyrim adam.*

**ƏYRİMÇƏ** *is. məh.* Üzük. *Səksən oxu əyrimçədən keçirdim; Heç kamımda arzumanım qalmadı.* "Koroğlu". *Əyrimçədən keçər beli qızların.* "Qurbani".

**ƏYRİM-ÜYRÜ** b a x **əyri-uyrü**.

**ƏYRİM-ÜYRÜM** b a x **əyri-üyrü**. *Əyrim-üyrüm küçə. Kəndin arası ilə əyrim-üyrüm gedən bağ yoluna çıxdıq. – Elə bil əkin yerlərinə əyrim-üyrüm qara zolaqlar çəkmişdilər.* İ.Şıxlı.

**ƏYRİ-OĞRU** *top.* Oğru, dələduz adamlar. *Mirzə Qulam xan da yazda-yayda .. valilərinə tabe olmayan əyri-oğruya qulaqburması verib, mal-dövlətini yoxlayıb çıxıb gedərdi.* M.Əliyev.

**ƏYRİPƏNCƏ** b a x **əyriayaq**. *Əyripəncə ayı.*

**ƏYRİSİNƏ** *zərf* Əyri olaraq, çəpinə. *Əyrisinə gedir. Sənə nə oldu, nə üçün düz yolda əyrisinə yeriyirsən?*

**ƏYRİSİZ** *sif.* Əyri yeri olmayan, düz olan. *Əyrisiz ağac olmaz, olsa da düz olmaz.* (Məsəl).

**ƏYRİTMƏ** "Əyritmək"dən *f.is.*

**ƏYRİTMƏK** b a x **əyiltmək**.

**ƏYRİ-ÜYRÜ** *sif.* 1. Çox yerindən əyilmiş, düz yeri olmayan. *Əyri-üyrü ağac. Əyri-üyrü məftil. – Müqim bəyin boynu qısa, qılçaları gödək, əyri-üyrü, qarnı qarpız kimi qalxıq, başı da aran yerinin düyələyi kimi yupyumru idi.* S.Rəhimov. *Qaş qaralır, əyri-üyrü daşların sıx kölgəsi; Qəbirlərin üstü ilə sürünür ilan kimi.* B.Vahabzadə. // Düz olmayan, düz istiqamətdə getməyən, çoxlu döngələri olan. *Əyri-üyrü küçələr. Əyri-üyrü xətt. Əyri-üyrü cığırlar. – Müəllim kəndin .. əyri-üyrü küçələri ilə gedirdi.* S.Hüseyn. *Qarlı güneyin sinəsində əyri-üyrü, çalın-çarpaz cığırlar əmələ gəlirdi.* B.Bayramov.

2. Bax **əyri** 2-ci mənada. *Əyri-üyrü adamdan qaçmaq lazımdır.* // İs. mənasında. *Mənim çarəm nədir? Mən gecə səhərə kimi gözümü yummuram, böyük şəhərdir, necə olsa beş nəfər əyri-üyrüsü olmayacaqmı?* M.S.Ordubadi.

3. Yanlış, qüsurlu, nöqsanlı. [Mirzə Səfər] *şeirlər oxuyardı və oxuyandan sonra da onları əyri-üyrü* (z.) *rus dilinə tərcümə edərdi.* Ə.Haqverdiyev.

◊ **Əyri-üyrü baxmaq** – bax **əyri-əyri** ("**əyri**"də). *Məcid, xanımın məzəmmətini eşitcək bir az əyri-üyrü ona baxdı..* B.Talıblı.

**ƏYYAM** *is.* [*ər.* "yovm" söz. cəmi] Günlər, çağ, zaman, dövr. *Keçən əyyam. Bu əyyamda* (bu dövrdə). *Biz gözəl əyyamda yaşayırıq. – Əyyami-baharü güldür, oğlum! Qoyma məni qəmdə, güldür, oğlum!* M.Ə.Sabir. *Bu hal necə ki haman əyyamda, habelə indi də hökmfərmadır.* C.Məmmədquluzadə.

**ƏYYAR** *sif.* və *is.* [*ər.*] Hiyləbaz, kələkbaz, çoxbilmiş, fırıldaqçı, dolandırıcı. *Qara pəhləvan yaman güclü, həm də yaman əyyar idi.* "Koroğlu". *Əyyar İbrahim Şiraza gələndən sonra Fərəc ixtisara düşən bir müəllim vəziyyətində qalmışdı.* Qantəmir. // Oğru, cibkəsən, evyaran. *Əyyarlar başladılar Dəmirçioğlunun üstünə bihuşdarı səpməyə.* "Koroğlu".

**ƏYYARLIQ** *is.* Oğruluq, fırıldaqçılıq, dolandırıcılıq. *Bu qəzvinli Şeydadır ki, gündüz sərraflıq elər, gecə əyyarlıq.* M.F.Axundzadə.

**ƏYYAŞ** *is.* [*ər.*] Vaxtını eyş-işrətlə, sərxoşluqla keçirən adam, içki düşkünü. *..Əyyaşların yurdu sayılan "Metropol" otelində bu gecə fövqəladəlik vardı.* M.S.Ordubadi. *..Ara-sıra rast gəldiyi gecə əyyaşlarının hay-küyü* [Məhbusinin] *nəzərini cəlb edə bilmirdi.* M.İbrahimov.

**ƏYYAŞLIQ** *is.* Vaxtını içki içməklə, eyş-işrətlə keçirmə, içki düşkünlüyü. *Əyyaşlıq böyük bədbəxtlikdir. – Əyyaşlığın sonu yorğunluq və səfalət, səfalətin sonu heçlik və fəlakətdir.* A.Şaiq.

**ƏZA**[1] *is.* [*ər.*] Yas, matəm. [Alim:] *Onlar* [tərəkəmələr] *bir növ avam .. tayfadırlar, əza məclisi və mərsiyəxan-zad tanımazlar, amma, əlhəmdülillah, yenə müsəlmandırlar.* Qantəmir. ☐ **Əza saxlamaq** – yas tutmaq, matəm saxlamaq. [Molla:] *..Qonaq gəlib əza saxlayanlar! Bu gecə başqa gecələrə bənzəməz.* M.Əliyev.

**ƏZA**[2] *is.* [*ər.*] *klas.* Əziyyət, zəhmət, məşəqqət, cəfa. *Mən dəliyəmmi özümü məktəbə, dərsə sövq edəm; Dərsin əzası bir belə, xalqın ədası bir belə.* M.Ə.Sabir. *Ay baba, salma qalmaqal, cövrü cəfadan əl götür! Dəng eləmə camaəti, cəbrü əzadan əl götür!* C.Cabbarlı.

**ƏZA**[3] *is.* [*ər.* "üzv" söz. cəmi] 1. Bədən üzvləri (Azərbaycan dilində bəzən "üzv" mənasında işlənir). *Quzunun parçalardı əzasın; Sındırıb kəlləsin, qabırğasın.* S.Ə.Şirvani. [Şahbaz bəy:] *Şəmsi, mənim bədənimdə bir sağ əzam yoxdur.* S.S.Axundov. *Hərdən başını qaldırıb nəzəri uşaqların solğun üzünə düşəndə* [Aslanın] *bütün əzası inildəyirdi.* C.Cabbarlı.

2. *köhn.* Bir cəmiyyət və ya heyəti təşkil edən üzvlərin məcmusu və ya hər biri. *Parlaman parladı əzası ilə.* M.Ə.Sabir. *Danışıqdan sonra məhkəmə əzası qərar çıxardıb hər kəsin haraya göndərilməsini təyin edəcəkdir.* Ə.Haqverdiyev. *..Çarın taxta oturan günü bütün konsulxana əzaları konsulxanadakı ziyafətə yığılmışdılar.* M.S.Ordubadi.

**ƏZAB** *is.* [*ər.*] 1. Əziyyət, üzüntü, işgəncə. *Toy-bayramdır bu dünyanın əzabı; Ağlı olan ona gətirər tabı.* M.P.Vaqif. [Nuriyyə:] *Əvvəl günlər, dünyada hər əzabın bir sonu olduğunu düşünərək özümə təsəlli verirdim.* İ.Əfəndiyev. *Əzaba, zəhmətə qatlaşmayaraq; Biz şəkilə baxıb şəkil çəkirik.* B.Vahabzadə. ☐ **Əzab çəkmək** – əziyyət çəkmək, sıxıntı çəkmək, dərd çəkmək, möhnət çəkmək. [Əsgər:] *..İstəyirəm qızı tez gətirsinlər ki, yazıq daha əzab çəkməsin.* Ü.Hacıbəyov. *Bağladım vəcdə gəlib hüsnünə şerimlə kitab; Bu yolun yolçusu tək dərdə dözüb çəkdim əzab.* S.Rüstəm. **Əzab görmək** – 1) bax **əzab çəkmək;** 2) cəzalandırılmaq. **Əzab vermək (etmək)** – əziyyət vermək, cəfa vermək, sıxıntı vermək, işgəncə vermək, incitmək. *Təklifi-cənnət eyləmə kuyində könlümə; Çün cənnət əhlidir, nə verirsən əzab ona?* Füzuli. [Sitarə:] *Fərhad, Fərhad, niyə mənə əzab verirsən, vicdanımı*

*parçalayırsan?* C.Cabbarlı. *Sanki tale* [Vahidə] *əzab verir, bütün düşünülməmiş işlərinin hayıfını çıxırdı.* İ.Hüseynov. **Əzaba salmaq** – əzaba, əziyyətə düşməsinə səbəb olmaq. *Salıbdır könlümü zülfün əzaba.* Q.Zakir. **Cəhənnəm əzabı** – çox böyük əzab, əziyyət. [Tükəzban:] *Fəhlələr yenə cəhənnəm əzabından qurtulmadılar.* M.Hüseyn.

2. Şiddətli mənəvi sıxıntı, əziyyət, ürək acısı. *Vicdan əzabı. – Xüsusilə Mayaya göstərdiyi üz, dediyi sözlər yadına düşəndə Qaraş əzabdan qovrulub yanırdı.* M.İbrahimov.

**ƏZAB-ƏZİYYƏT** bax **əzab** 1-ci mənada. [Cümşüd] *qocanın min əzab-əziyyətlə dolu həyat yoluna nəzər salır, bu həyatın mənasını aramaq istəyirdi.* S.Rəhimov.

**ƏZAB-ƏZİYYƏTLİ** bax **əzablı.** *Əzab-əziyyətli iş. Əzab-əziyyətli yol.*

**ƏZAB-İŞGƏNCƏ** bax **əzab** 1-ci mənada. *Əzab-işgəncə çəkmək. Əzab-işgəncələr görmək. – .. Əhməd bütün əzab-işgəncələrin nə üstündə başlandığını unudub, Tovuzun yanına qayıdacaqdı.* M.Süleymanov.

**ƏZABLI** *sif.* Çox əziyyətli, sıxıntılı, çətin; əzab və əziyyətlə dolu. *Əzablı iş. Əzablı isti. Əzablı yol. – Neft səltənəti Bakıda neft tapmaq əzablı bir işə çevrilmişdi.* A.Şaiq. *Bu bir ay Bilqeyis üçün sıxıntılı və əzablı keçdi.* S.Vəliyev.

**ƏZABLI-İŞGƏNCƏLİ** bax **əzablı**. *Əzablı-işgəncəli yol. Əzablı-işgəncəli iş.*

**ƏZABLILIQ** *is.* Əzablı şeyin hal və keyfiyyəti; əziyyətlilik.

**ƏZABSIZ** *sif.* Heç bir əzabı, əziyyəti olmayan, əziyyətsiz, asanlıqla əldə edilən, asanlıqla yerinə yetirilən, yüngül, asan. *Əzabsız iş. Əzabsız yol.*

**ƏZABVERİCİ** *sif.* Cismani, yaxud ruhi əzab verən, incidən, çox əziyyətli. *Əzabverici yara. Əzabverici hiss. – Artıq Məcidin sözləri* [Nadir] *üçün əzabverici olmayıb, .. mehriban bir ananın nəğməsinə bənzəyirdi.* B.Talıblı.

**ƏZA-CƏFA** *is.* [*ər.*] Əzab və əziyyət. [Şah:] *Keşiş, gözümün ağı-qarası bir nəfər oğlum var. Mən onun əza-cəfasına razı ola bilmərəm.* Ü.Hacıbəyov.

**ƏZADAR** *is.* [*ər.* əza və *fars.* ...dar] *klas.* Əza saxlayan, əzalı; yas saxlayan, yaslı.

**ƏZADARLIQ** *is.* Əza saxlama, yas saxlama; yaslılıq.

**ƏZAN** [*ər.*] bax **azan.**

**ƏZAZİL** [*ər.*] 1. *is.* Şeytan. *Onu əzazil də aldada bilməz. – Əhsəni-təqvimi inkar eylər imansız fəqih; Şol əzazilin ki adın həq deyər, şeytan budur.* Nəsimi.

2. *sif. məc.* Zalım, amansız, rəhmsiz, insafsız, qəddar. *Əzazil adam. Əzazil ata. – Nuşəfərinin atası çox əzazil və zalımdı.* (Nağıl). *Qara xan əzazil bir xan idi.* "Koroğlu". *Şişman qadın əzazil bir qayınana idi.* S.Hüseyn.

**ƏZAZİLCƏSİNƏ** *zərf* Zalımcasına, insafsızcasına, amansızcasına, qəddarcasına. *Əzazilcəsinə incitmək. Əzazilcəsinə əziyyət vermək.*

**ƏZAZİLLİK** *is.* Zalımlıq, insafsızlıq, amansızlıq, qəddarlıq. *Sabiq milyonerin arvadı Nərmin onun əzazilliyini görəndə üsyan edib deyir ki, dövlətlilər amansız və mürüvvətsizdirlər..* M.Hüseyn.

**ƏZBƏR** 1. *is.* Bir mətni və ya sözü eyni ilə təkrar edilə biləcək şəkildə yadda, hafizədə saxlama. □ **Əzbər etmək (eləmək)** – bax **əzbərləmək.** [Ruqiyyə xanım] *bütün elmləri əzbər eləyib, açarını qoymuşdu cibinə.* "Koroğlu". *Ertə durarsan səhər; Dərsi edərsən əzbər.* A.Səhhət.

2. Bax **əzbərdən.** *Əzbər bilmək. Əzbər oxumaq. – Sona yenə taxta yığışıb Bahadırın kağızını əzbər oxuyurdu.* N.Nərimanov.

◊ **Dillərdə əzbər olmaq, dillər əzbəri olmaq** – bax **dil**[1].

**ƏZBƏRÇİ** 1. *sif.* Dərsini anlayıb-anlamadan, olduğu kimi, kəlməbəkəlmə hazırlayan, əzbərləyən. *Əzbərçi tələbə* (*şagird*).

2. *is.* Çox oxumuş, lakin oxuduğunu mexaniki surətdə, qeyri-tənqidi mənimsəmiş adam haqqında.

**ƏZBƏRÇİLİK** *is.* Mənasını bilmədən, dərindən öyrənmədən, mexaniki surətdə əzbərləmə. *Məktəblərdə əzbərçiliklə mübarizə aparmaq lazımdır.*

**ƏZBƏRDƏN** *zərf* Əzbər olaraq, yazıya baxmadan; döşdən, hafizədən. *Şeri əzbərdən oxumaq. – Bilirəm, Puşkini çoxdan sevirsən; Qızın da, oğlun da əzbərdən desin.* S.Vurğun. *Çoxusu əzbərdən şeirlər söyləyirdi.* M.İbrahimov.

**ƏZBƏRƏ** *dan.* bax **əzbərdən.** *Əzbərə şeir demək. Poemanı əzbərə oxudu.*

**ƏZBƏRLƏMƏ** "Əzbərləmək"dən *f.is.*

**ƏZBƏRLƏMƏK** *f.* Əzbər etmək, oxuduğu və ya eşitdiyi bir şeyi olduğu kimi zehnində saxlamaq, mənimsəmək. *Şeri əzbərləmək. Rolunu əzbərləmək. – ..Marallarım .. moizə kitablarını rəfdən alıb, tozlarını təmizləyib başlayırlar əzbərləməyə.* Ə.Haqverdiyev. *Namiq Kamalın bu şerini Mirzə Süleyman bəy .. əzbərləmişdi.* B.Talıblı.

**ƏZBƏRLƏNMƏ** "Əzbərlənmək"dən *f.is.*

**ƏZBƏRLƏNMƏK** *f.* Əzbər yadda saxlanmaq, əzbər öyrənilmək, əzbər edilmək. *Şeir əzbərlənmişdir. – Savadlı gənclərin bəyazı olardı, bu bəyazlara ana dilindəki şeirlərin nəfis parçaları köçürülər, əzbərlənərdi.* Çəmənzəminli.

**ƏZBƏRLƏTDİRMƏ** "Əzbərlətdirmək"dən *f.is.*

**ƏZBƏRLƏTDİRMƏK** *icb.* Əzbərləməyə məcbur etmək.

**ƏZBƏRLƏTMƏ** "Əzbərlətmək"dən *f.is.*

**ƏZBƏRLƏTMƏK** *icb.* Əzbər öyrətmək, yadda saxlatmaq. *Şeri əzbərlətmək. Poemanı əzbərlətmək.*

**ƏZBƏS** *zərf* [*fars.*] *klas.* 1. Kifayətcə, çox miqdarda, həddindən artıq. *Hər yanda böyük xəndək, hər küçədə min dağ; Əzbəs tökülüb bir-birinin üstünə torpaq.* A.Səhhət.

2. Bəzən "ki" bağlayıcısı ilə: **əzbəs ki** – səbəb bildirir. *Dedi: "Əzbəs ki halətim yoxdur; Yeməyə hiç rəğbətim yoxdur".* M.Ə.Sabir. [Qulu:] *Əzbəs ki* [Yusifin] *xasiyyəti və mehribançılığı məni özünə qul edibdir..* N.Nərimanov.

**ƏZCÜMLƏ** [*fars.* əz və *ər.* cümlə] *kit. köhn.* O cümlədən.

**ƏZDAD** *is.* [*ər.*] *köhn.* 1. Zidd sözünün cəmi (zidlər).

2. *köhn.* Rəqiblər.

**ƏZDİRMƏ** "Əzdirmək"dən *f.is.*

**ƏZDİRMƏK** "Əzmək"dən *icb.*

**ƏZƏL** [*ər.*] 1. *is.* Əvvəli, ibtidası olmayan keçmiş zaman (*əbəd* müqabili). *Səbəb nə oldu ki, peymanü əhdi sındırdın? Vəfavü əhdə əzəl etibar edən sən idin.* X.Natəvan.

2. *zərf* Əvvəl, irəli, qabaq, ilkin, əvvəlcə, qabaqca. *Əzəl sən gəl. – Əzəl bunu, sonra da o birisini min, təzəcə sulanmış şumda səyirt, qaratikanlığa sür, sonra da sıldırım daşlı dağa çap.* "Koroğlu". *A kişi, bundan əzəl xalqda hörmət var idi.* M.Ə.Sabir. // *sif.* İlk, birinci. *Su gəldi, dağdan axdı; Dağdaşa ün buraxdı; Məhəbbət şirin şeydir; Hər kəsin əzəl bəxti!* (Bayatı). *Dizi üstə əzəl alıb başımı; Sildi lütf ilə qanlı göz yaşımı.* A.Səhhət. □ **Əzəl başdan (gündən)** – lap əvvəldən, başlanğıcdan, qabaqdan. *Əzəl başdan Bəsrə, Bağdad eliniz; Bəylər üçün ərməğandır teliniz.* M.V.Vidadi. *Bir aynadır bizim səhnə; Bir aynadır əzəl başdan; Xalqımızın həyatını; Əks etmişdir hər bir zaman.* B.Vahabzadə. *Vurub qoltuğuna sədəfli sazı; O da əzəl gündən telə bağlıdır.* H.Arif.

3. Cəm şəklində: **əzəllər** – qabaqlarda, keçmişdə, əvvəllər. *Qəm deyildi, sevsə idi əzəllər; Eşidən tən edib, indi lağ eylər.* Q.Zakir. *Sonralar sevilib bəyənilmədi; Əzəllər kimsəni bəyənməyən qız.* H.Arif.

**ƏZƏLCƏ** *zərf* Əvvəlcə, qabaqca, birinci olaraq. *Əzəlcə söz kimə verildi? Əzəlcə qoy o keçsin.*

**ƏZƏLDƏN** *zərf* Lap əvvəldən, ilk vaxtdan, ibtidadan. *Əzəldən deyər ki, bəri dur, bəri; İrəli gedərsən, o durar geri.* Q.Zakir. *Biganələrlə çünki olub aşina könül; Ey kaş, olmayaydım əzəldən mən aşina!* S.Ə.Şirvani. *Əzəldən belədir, hər yeni şair; Bir yeni yol bulub, bir əməl bəslər.* Ə.Cavad. *Əzəldən düşmənəm qorxu ilə mən.* M.Rahim.

**ƏZƏLƏ**[1] *is.* [*ər.*] *anat.* İnsan və heyvan bədəninin, hüceyrələrdən ibarət olub, yığıla bilən orqanı və ya onun bir hissəsi; muskul. *Qolunun əzələsi daş kimidir. Əzələ fəaliyyəti. Ürək əzələsi. Qıç əzələləri. – Qolunu açdı, bükdü, dedi: – Əzələyə bax! Heç bilirsənmi nədir ikipudluq oynatmaq?* R.Rza.

**ƏZƏLƏ**[2] [*ər.* "əzəl"dən] bax **əzəl** 2-ci mənada. *Ədalət var idi bundan əzələ; Yaman yerə yetib iş gələ-gələ.* Q.Zakir.

**ƏZƏLƏLİ** *sif.* İnkişaf etmiş əzələləri olan. *Əzələli qollar. – Həmişə fiziki işdə çalışan adamlara məxsus yoğun əzələli bir gəncin gurultulu səsi onların danışığını kəsdi.* M.İbrahimov. // Əzələləri qüvvətli. *Çox əzələli pəhləvandır, onu basmaq çətindir.*

**ƏZƏLƏSİZ** *sif.* Əzələləri inkişaf etməmiş, əzələləri zəif olan. *Əzələsiz qollar.*

**ƏZƏLİ** *sif.* [*ər.*] Zamanca başlanğıcı, ibtidası olmayan (*əbədi* müqabili). *Kəhkəşan südlü nəhri andıraraq; Əzəli bir kitab oxurdu mana.* H.Cavid. *Bu doğrudur, sevda olur əzəli; Mən şairəm həyatımdan bezəli.* Ə.Cavad. *Həyatın əzəli bir qanunu var; İşsiz hünər yoxdur, hünərsiz də iş.* S.Vurğun.

**ƏZƏLİLİK** b a x **əzəliyyət**.

**ƏZƏLİYYƏT** *is.* [*ər.*] *kit.* Əzəlilik, zamanca ibtidasızlıq, əvvəli olmayacaq qədər qədimlik (*əbədiyyət* müqabili).

**ƏZƏLKİ** *sif.* Əzəldə olan, əvvəlki. *Əzəlki danışıq. Əzəlki vəziyyət. – Kəsilibdi indi gəlib-getməyin; Əzəlki çağını könlüm arzular.* Q.Zakir. *Çün səni əfv edib xudayi-cahan; Genə verdi əzəlki surətini.* S.Ə.Şirvani.

**ƏZƏM** *sif.* [*ər.*] *köhn.* Böyük, ən böyük, ulu (adətən vəzifə adlarına qoşulur; məs.: sədri-əzəm – Sultan Türkiyəsində baş nazir). [Yasavul:] *Mən bu cəhəti canişini-əzəmə yazdığım raportlarda qeyd etmişəm.* S.Rəhimov.

**ƏZƏMƏT** *is.* [*ər.*] 1. Böyüklük, ululuq. *İstərsən əgər şahlıq, şöhrət, əzəmət, hörmət; Həm əhdə vəfa eylə, həm faili-peyman ol!* Heyran xanım.

2. Dəbdəbə, calal, təmtəraq, ehtişam. *Xəlifələrin əzəmət və şöhrəti sönür.* M.S.Ordubadi. *Üstündən əsrlər adlayıb keçsə belə, Aslanın qurduğu binalar öz əzəmət və təmtərağını itirməyəcəkdir.* S.Rəhimov. *Bu təpədən baxdıqda Bakının mənzərəsi bütün əzəməti ilə göz qarşısında canlanırdı.* S.Rəhman. // Vüqar, qürur. *Qaragözlü qız, gəlinlər, ağbirçəkli analar; Duruşunda bir əzəmət, baxışında bir vüqar.* R.Rza.

3. *zərf* **Əzəmətlə** şəklində – təntənə ilə, ehtişamla, təmkinlə, vüqarla. *Sağımızda-solumuzda, önümüzdə; atlılar əzəmətlə durub bizi gözləyirdilər.* S.Rüstəm. *Bəzən əzəmətlə keçir adamlar; Səngərə çevrilib sıravi damlar.* M.Rahim.

**ƏZƏMƏTLİ** *sif.* Böyük, möhtəşəm. *Əzəmətli qala. Əzəmətli dağlar. – Ta o dərəcəyə kimi ki, hətta İstanbul kimi bir əzəmətli paytaxtda telefon çəkməyi Sultan Əbdülhəmid qadağan etmişdi.* C.Məmmədquluzadə. *Təyyarəmiz başdan-başa qarla örtülmüş bu əzəmətli şəhər üzərində uçur.* M.Hüseyn. *Misirli özü çəkdi; Qədim Memfis şəhərinin; Əzəmətli səddini.* O.Sarıvəlli. // Dəbdəbəli, təmtəraqlı, möhtəşəm, calallı. *Vaxtı ilə bir qismi miskin və fəqir, bir qismi də möhtəşəm və əzəmətli qəbirlərdən bir əsər və əlamət qalmamışdı.* S.Hüseyn. *Böyük, əzəmətli bir saray çilçıraq içərisində yanırdı.* S.Rəhman.

**ƏZƏMİ**[1] *sif.* [*ər.*] *köhn.* Ən çox, maksimum. *Azərbaycan .. nasirləri klassik rus realizminin ən qüvvətli cəhətlərindən – onun demokratlığından, həyat həqiqətlərinə əzəmi dərəcədə sadiq qalmağından .. öyrənirlər.* M.Hüseyn. *Əhmədov fəhlə qüvvəsindən əzəmi dərəcədə istifadə etməklə kifayətlənmədi.* Mir Cəlal.

**ƏZƏMİ**[2] *is.* [*ər.*] 1. Keçmişdə palto kimi üstdən geyilən içi xəzli paltar.

2. Müsəlman dini təriqətlərindən birinin adı.

**ƏZƏMİYYƏT** *is.* [*ər.*] *klas.* Böyüklük, ululuq, əzəmət.

**ƏZGİL** *is.* Qoz iriliyində, ətli, çəyirdəkli, sarı rəngli, təpəsi pipikli bir meyvə və onun ağacı. *Əzgil ağacı. Əzgil meşəsi. Cır əzgil. – Meşənin dəymiş əzgili saralar; Həm zoğal da dərilməyib qaralar.* A.Səhhət. *Əzgil 5-6 metr hündürlükdə, qışda yarpağı tökülən ağac və ya kol şəkilli bitkidir. Güney yerlərdə, münbit və rütubətli torpaqlarda daha yaxşı bitir.* H.Qədirov.

**ƏZGİLLİK** *is.* Əzgil ağacları bitmiş yer, əzgil meşəsi, əzgil kolluğu. *Bağın bir tərəfi əzgillikdir.*

**ƏZGİN** *sif.* Əzinik, yorğun, halsız, taqətsiz. *Hər tərəfdə əzgin kəndlilər bəylərdən intiqam almağa başladılar.* H.Nəzərli. *Qaraş özünü itirməyib diqqətlə baxsaydı, atasının yuxudan çox yorğun və əzgin* (z.) *qalxdığını görərdi.* M.İbrahimov.

**ƏZGİNLƏŞMƏ** "Əzginləşmək"dən *f.is.*

**ƏZGİNLƏŞMƏK** *f.* Əzgin hala düşmək.

**ƏZGİNLİK** *is.* Özünü əzgin hiss etmə, əzgin halda olma. *Bədənində əzginlik hiss etmək.*

**ƏZGİN-ÜZGÜN** *sif.* və *zərf.* Çox əzgin. *Əzgin-üzgün şalvar. – Müqim bəy durub əzgin-üzgün halda çıxdı.* S.Rəhimov.

**ƏZİCİ** *sif.* 1. Çox ağır, çox güclü, məhvedici, sarsıdıcı. *Əzici zərbə.*

2. Ruhu incidən, ağır təsir bağışlayan. *Fəxrəddin bu qədər əzici fikirlərin təsirində qıvrıldığı zaman oxuyan qız da Dilşada yazılmış qəzəlləri oxumağa başladı.* M.S.Ordubadi. [Qurban] *içində əzici və acı bir sızıltı duydu.* A.Şaiq. *Firidun sərtibin üzündə hər şeydən yorulmuş, hər şeyə nifrət edən, dərdli bir narazılığın əzici ifadəsini gördü.* M.İbrahimov.

**ƏZİK** *sif.* 1. Əzilmiş. *Əzik meyvə. Əzik pomidor.*

2. Ütüsü, şaxlığı, hamarlığı getmiş; hamar olmayan. *Əzik köynək. Əzik qəzet. – Fərhadoğlu əzik paltarlarının üstündə əlini gəzdirirdi.* S.Rəhimov.

3. Batıq, çökük. *Əzik parç. Samovarın bir böyrü əzikdir.* // *is.* Əzik yer. *Əziyi düzəltmək.*

4. *is. tib.* Yumşaq toxumaların zədələnməsi ilə birlikdə qan damarlarının qırılması nəticəsində əmələ gələn zədə yeri. *Ayaqdakı əzik. Əlində əzik var.*

**ƏZİK-ƏZİK** *zərf* 1. Tamamilə əzilmiş halda. ☐ **Əzik-əzik eləmək (etmək)** – 1) tamamilə, hər yerini əzmək. *Uşaqlar meyvələri əzik-əzik etdilər;* 2) sındırmaq, parça-parça etmək. *Maşının çarxları yeşiyi əzik-əzik etdi.* **Əzik-əzik olmaq** – 1) tamamilə əzilmək. *Əzik-əzik olmuş meyvə;* 2) sınmaq, parça-parça olmaq. *Xırdavat* [zənbilləri], *əl arabaları dəmir təkərlər altında əzik-əzik oldu.* Mir Cəlal. // Sif. mənasında. *Əzik-əzik paltarlar.*

2. *dan.* Özünü əzə-əzə, naz-qəmzə ilə, özünü utanan kimi göstərə-göstərə. *Əzik-əzik danışmaq.*

**ƏZİKLİK** *is.* Əzik şeyin halı. *Almanın əzikliyinə baxma, çürük deyil.*

**ƏZİK-ÜZÜK** *sif.* 1. Çox əzilmiş. *Əzik-üzük meyvə.* – [Qurban:] *..Hər ağac altından üç-dörd çuval əzik-üzük alma yığmışıq.* Ə.Məmmədxanlı.

2. Hamarlığı, şaxlığı, düzlüyü getmiş, əzilmiş. *Əzik-üzük köynək. Əzik-üzük yaylıq. – Yarməmməd portfelindən bir dəstə əzik-üzük kağız çıxardı.* M.İbrahimov.

3. Sınıq, sınıq-salxaq, əyri-üyrü. *Əzik-üzük stol.* – [Koroğlu:] *Canım, bunlar əzik-üzük dəmir parçalarıdır, nal gətir!* "Koroğlu".

**ƏZİLİB-BÜZÜLMƏ** *is.* Naz, qəmzə, işvə, naz satma, nazlanma.

**ƏZİLİB-BÜZÜLMƏK** *f.* 1. Nazlanmaq, naz etmək. [Ələmdar] *əzilib-büzülən, şirindil xanımların başları üstündən uzun dimdiyini sallayıb .. baxdı.* S.Rəhimov.

2. *məc.* Cavabdan qaçmağa çalışmaq, tərəddüd etmək. *Yasavulbaşı əzilib-büzülməyə başladı.* M.Rzaquluzadə.

3. Əzilmək, əzik-əzik olmaq. *Əzilib-büzülmüş paltarı ütüləmək. – Maya ayağa durdu, əzilib-üzülmüş balışı çırpdı.* M.İbrahimov.

**ƏZİLMƏ** "Əzilmək"dən *f.is.*

**ƏZİLMƏK** *f.* 1. Basılaraq, yaxud ağır bir şeyin altında qalaraq, ya sıxılaraq əzik hala gəlmək; zədələnmək. *Meyvələr yeşikdə əzilmişdir. Paltarlar əzilmişdir. – Mən əzilmiş kol-kosları, sınıq budaqları gördüm.* Ə.Məmmədxanlı.

2. Toza çevrilmək, narın hala gəlmək, toz halına gəlmək.

3. *məc.* Məhv edilmək, məğlub edilmək, döyülmək, darmadağın edilmək. *Düşmən əzildi.* – [Uluq bəy:] *Vurun, hey, igidlər, bizimdir zəfər; Dəmir məngənədə əzilir qeysər.* A.Şaiq.

4. *məc.* Zülm altında olmaq, təzyiq altında olmaq, istismar edilmək, məhkum edilmək. *Mən əzilən bir sinfin hayqıran; Haq bağıran sədasından yarandım.* M.Müşfiq.

5. *məc.* Nazlanmaq, naz etmək, əzilib-büzülmək. [Nazlı:] *Eh, siz şəhər qızları, çox ərköyünsünüz. Əzilirsiniz, süründürürsünüz, adamın canını üzürsünüz..* Ə.Məmmədxanlı. [Gövhər:] *Onun böyük bacısı səninlə çox əzilə-əzilə* (z.) *danışır, ay Xəlil.* S.Rəhman.

**ƏZİM** *sif.* [*ər.*] *klas.* 1. Böyük. *Hər birisinin başına şuriş və tüğyan xəyalı düşdü və tezliklə Qəzvində şurişi-əzim bərpa oldu.* M.F.Axundzadə. // Çoxlu. *Baxdım ki, əzim bir cəmaət; Eyzən ürəfa, əvət, həqiqət.* M.Ə.Sabir.

2. Ulu, böyük, yüksək, ali. *Birisi ona övliya, o birisi ona yelbeyin, birisi ona əzim, o birisi ona vəzir adını verirdi.* S.Rəhimov.

**ƏZİMƏT** *is.* [*ər.*] Bir yerə doğru hərəkət, yola çıxma, yola düşmə, üz qoyub getmə. ☐ **Əzimət etmək (eyləmək)** – getmək, yola düşmək, getməyə üz qoymaq. *Noldu səbəb eylədin əzimət?* Füzuli.

**ƏZİM-ƏZİM: əzim-əzim olmaq (əzilmək)** – tamamilə əzilmək, əzik-əzik olmaq, parça-parça olmaq. *Kukla yerə düşüb əzim-əzim oldu.* – [Gəray ağa:] *Bizim bu fırtınada üzən gəmimiz daşa çırpınıb əzim-əzim olub!* S.Rəhimov.

**ƏZİMÜŞŞAN** *sif.* [*ər.*] *klas.* Mərtəbəsi, dərəcəsi yüksək. *Bir əcəb insandır, xub növcavandır; Hökmi-Süleymandır, əzimüşşandır.* Aşıq Saleh.

**ƏZİNİK** *sif.* 1. Əzik, əzilmiş. *Əzinik qovun.*

2. Yorğun, üzgün, əzgin. *Mədəd işdən qayıdandan sonra əzinik* (z.) *yerə girdi, bir azdan yuxuladı.* S.Rəhimov.

3. Mərhəmət diləyən, yalvarıcı, yazıq. *O, əzinik bir səs çıxardı: – Ağa, rəhm edin!* S.Rəhimov.

**ƏZİNTİ** *is.* 1. Ovuntu, əzilib ovulmuş şeylər. *Qənd əzintisi. Nabat əzintisi.*

2. Bax **əzik** 3-cü mənada. *Samovarın əzintisini düzəltmək. Parçın əzintisindən su sızır.*

3. Bədəndə hiss edilən əzginlik, yorğunluq, üzgünlük. *Bədənində əzinti hiss etmək.*

**ƏZİŞDİRİLMƏ** "Əzişdirilmək"dən *f.is.*

**ƏZİŞDİRİLMƏK** *məch.* 1. Əzgin hala gətirilmək.

2. Döyülmək, kötəklənmək.

**ƏZİŞDİRMƏ** "Əzişdirmək"dən *f.is.*

**ƏZİŞDİRMƏK** *f.* 1. Ora-burasını əzmək, bərk əzmək. *Quyudan çıxan daş qırıntıları güllə kimi .. gəlir və qabağına keçən hər şeyi əzişdirirdi.* M.Hüseyn.

2. Ovuşdurmaq, övkələmək, ovxalamaq. *Gülşad ixtiyarsız olaraq barmaqlarını əzişdirdi.* Ə.Vəliyev.

3. *məc.* Döymək, kötəkləmək, qol-qabırğasını əzmək. *Telli kandarda çıxardığı başmaq tayını aldı,* [pişiyi] *əzişdirəcəkdi.* S.Hüseyn. *Məşədi Əsgər o qədər zorlu idi ki, üç-dörd elə hambalları büküb-bükmələyib əzişdirə bilərdi.* S.M.Qənizadə. *Qonşum az qaldı məni divara dirəyib əzişdirsin.* S.Rüstəm. // *məc.* Məğlub etmək, darmadağın etmək. *Dayan, almanları əzişdirək qoy; Hüseynə edərik yaxşıca bir toy.* M.Rahim.

**ƏZİYYƏT** *is.* [*ər.*] 1. Məşəqqət, əzab, cəfa. *Yolun əziyyəti. Əziyyətə rast gəlmək. – Bəli, Yer üzünün bu mənzərəsi; Arabir məni də salır qüvvətdən; Həyat qurtarmadı bu əziyyətdən.* S.Vurğun. // Ağrı, ağrı-acı. *Yaranın əziyyəti.* ☐ **Əziyyət çəkdirmək** – əziyyətə məruz etmək, əziyyət, əzab çəkməsinə səbəb olmaq, əziyyət vermək, məşəqqət çəkdirmək. *Çəkdirir çox bizə əziyyətlər; Həm verir xeyli-xeyli zəhmətlər.* A.Səhhət. **Əziyyət çəkmək** – əzab çəkmək, məşəqqət çəkmək, ağrı-acı çəkmək. *Xəstəlikdən çox əziyyət çəkmişdir. Yazıq baş ağrısından çox əziyyət çəkir. – Deyir: – Qoy isinsin, o, can üstədir; Əziyyət çəkməsin bir neçə günlük.* M.Rahim. **Əziyyət olmaq** – əziyyətə, məşəqqətə, zəhmətə, çətinliyə, qayğıya səbəb olmaq. *Qorxuram, sizə əziyyət ola.* – [Mozalan bəy:] *Oyundan camaata çox əziyyət olur.* Ə.Haqverdiyev. **Əziyyət vermək (etmək, eləmək)** – incitmək, çox narahat etmək. *Diş ağrısı çox əziyyət verir. Yara əziyyət edir. – Çox əziyyət verib çovğun, yağmur, bad; Xatirə gəlməyib nə düşmən, nə yad.* Aşıq Ələsgər. *Verməmişəm mən ki xəsarət sənə; Sən də dəxi vermə əziyyət mənə.* A.Səhhət. **Əziyyətə salmaq** – narahat etmək, zəhmət vermək, əziyyətə düşməsinə səbəb olmaq. *Əziyyətə saldığım üçün üzr istəyirəm.* – [Böyükxanım:] *Bu elm sizi narahat etməz, bir az da atanız kimi əziyyətə salar.* M.S.Ordubadi. **Əziyyəti dəymək (toxunmaq)** – zərəri olmaq, zərər vermək, ziyanı olmaq. *Adamlara əziyyəti dəymək. Çovğunun camaata çox əziyyəti dəydi.* **Əziyyəti olmaq** – əziyyət vermək, incitmək. *Doğrudan deyirmişlər ki, Nikolayın bizə çox əziyyətləri olub.* C.Məmmədquluzadə.

2. Ağır zəhmət, ağır iş, zəhmətli və çətin iş. *Çünki bilir rahət əziyyətdədir; Şad yaşamaq səydə, qeyrətdədir.* M.Ə.Sabir. [Mirzə Cavad:] *Ay balam, nahaq yerə bu əziyyət nə lazımdır, niyə özünü incidirsən?* Ə.Haqverdiyev. *Binəvanın üzündə və gözlərində əziyyət nişanələri oynaşıb, çox zəlalətlərə düçar olduğuna işarə verirdi.* A.Divanbəyoğlu. ☐ **Əziyyət çəkmək** – zəhmət çəkmək, çox işləmək, zəhmətli işlə məşğul olmaq. *Bağ salmaq üçün əziyyət çəkmək lazımdır.*

**əziyyətlə** *zərf* 1) böyük çətinliklə, məşəqqətlə, əzabla, əziyyət çəkə-çəkə. *Əziyyətlə yerimək. – Mələk nənə əvvəl diz üstə*

*çöküb, sonra ağaca dayanıb, əziyyətlə qalxıb yola düşdü.* Ə.Haqverdiyev; 2) əziyyət verilərək, işgəncə ilə. *Kəndin ortasında müxtəlif işgəncə və əziyyətlə öldürülmüş meyitlərə baxanda adamın tükləri ürpərirdi.* Ə.Vəliyev.

**ƏZİYYƏTLİ** *sif.* Əzablı, məşəqqətli, əzab və əziyyətlə bağlı olan. // Çox ağır və yorucu; üzücü. *Əziyyətli yol. Əziyyətli iş. Əziyyətli həyat.* // Çox zəhmət tələb edən. *Lüğətçilik çox əziyyətli işdir.*

**ƏZİYYƏTLİLİK** *is.* Əzablılıq, məşəqqətlilik; ağırlıq, zəhmətlilik, yoruculuq, üzücülük. *Yolun əziyyətliliyi.*

**ƏZİYYƏTSİZ** 1. *sif.* Əzabsız; asanlıqla, çətinlik çəkmədən əldə edilən, görülən. *Əziyyətsiz iş. – Qışsız bahar olmadığı kimi, döyüşsüz, əziyyətsiz, qurbansız da qələbə, xoşbəxt həyat yoxdur.* Ə.Abasov.

2. *zərf* Əziyyət vermədən, əzab vermədən, incitmədən. [Pəri Cadu:] *Bu, Qurbandır, gərək onu əziyyətsiz gətirəsən.* Ə.Haqverdiyev.

3. *sif.* Heç kəsə əziyyəti, azarı dəyməyən; zərərsiz, ziyansız, azarsız; dinc, sakit. *Əziyyətsiz adam.*

**ƏZİYYƏTSİZLİK** *is.* 1. Heç bir əziyyətin, çətinliyin olmadığı hal və keyfiyyət. *İşin əziyyətsizliyi. Yolun əziyyətsizliyi.*

2. Əziyyətsiz (3-cü mənada) adamın hal və keyfiyyəti.

**ƏZİZ** *sif.* [*ər.*] 1. Sevimli, istəkli, ürəyə yaxın. *Əziz oğul. Əziz yoldaş. Əziz dostlar!* – [Yusif:] *Açım kağızı, görüm, mənim əziz nuri-çeşmim Şamdan bəy nə yazır?* N.Nərimanov. *Amma Züleyxa, Əsgərin əziz qardaşı ilə olan pis rəftarını görüb Əsgəri sevmirdi.* C.Cabbarlı. // Mehriban, məhəbbətli, şəfqətli, sevən. *Balamsan sən, nəyimsən? Arxamsan, köməyimsən; Mən sənin əziz anan; Sən mənim diləyimsən.* (Layla). ◻ **Əziz olmaq** – hörmət bəslənilmək, hörmət edilmək; əzizlənmək. *Oğul! Bir qayda var eldə-obada; Qonaq əziz olar, qaçaq olsa da.* S.Vurğun. **Əziz tutmaq** – 1) çox istəmək, hörmət bəsləmək, qayğı bəsləmək. *..Şəhrəbanu arvad Qəhrəmanı oğul və nəvələrindən əziz tuturdu.* S.Rəhimov. *Camaat Səttarzadənin xətrini əziz tutur.* Mir Cəlal; 2) hörmət və ehtiram bəsləmək. *Bayramı əziz tutmaq.* // Ərköyün, ən istəkli. *Ananın əziz qızı.* // Ən qiymətli, ən dəyərli, ən istənilən. *Əziz ömrüm. – Sevdiyin əziz bir şeyə and iç!* M.S.Ordubadi. *Mən ona əziz şey kimi baxmırdım.* Mir Cəlal. // Doğma, çox yaxın, çox sevilən. *Əziz ev. Əziz ailə. Əziz yurd.* // Mübarək, ən hörmətli, müqəddəs. *Bu əziz adla çiçəkləndi könüllərdə bahar; Bir qonaqdır əbədi, məncə, bu ellərdə bahar.* S.Rüstəm. *Bu əziz bayram günü, adın çəkiləndə; Kim duymayır qəlbinin həyəcanla vurduğunu?* R.Rza.

2. Ən çox istənilən, ən çox tələb olunan, ən çox sevilən. [Heydər bəy:] *Hər nə isə, başa düşürsənmi ki, burada firəng çiti nə əzizdir?* M.F.Axundzadə. // Az tapıldığı, çətin ələ düşdüyü üçün çox qiymətli sayılan. *Nə qədər şirindir qəlbə məhəbbət; Ömrün mənasıdır bu əziz nemət.* S.Vurğun. *Ömrümün üstünə bir əlli də artırsan əgər; Heç silinməz ürəyimdən o əziz, xoş dəmlər.* S.Rüstəm. ◻ **Əziz olmaq** – az tapıldığı, çətin ələ düşdüyü üçün çox qiymətli, hörmətli olmaq, müqəddəs bir şey kimi baxılmaq. *Pul əziz olmuş cahan əhlinə o qayətdə kim; Ta sanıblar əskinası Cəbrailin şahpəri.* S.Ə.Şirvani.

3. **Əzizim** şəklində – 1) nəvazişlə müraciət. *Əzizim, gəl gedək. – Bu bədbəxtin halətindən, əzizim; Bari o vilada olgil gözqulaq.* Q.Zakir. [Turxan bəy:] *Gedə bilərsən, əzizim!* H.Cavid. *Mina cavab verdi ki, əmin olunuz, əzizim!* İ.Musabəyov; 2) bax **əziziyəm**. *Əzizim, söz deməkdən; Yoruldum söz deməkdən; Nə sən yoldan yoruldun; Nə mən yol gözləməkdən.* (Bayatı). // **Əziziyəm** şəklində – bayatıların başında gələn ilk söz. *Əziziyəm, dilən, gəz; Bağda gülə dilən, gəz. Qürbətdə xan olunca; Vətənində dilən, gəz.* (Bayatı).

◊ **Əziz başın üçün** – birini inandırmaq üçün and məqamında işlədilir. *Əziz başın üçün gələcəyəm. – Əziz başın üçün, oxu yazdığım; Agah ol halımdan gahbagah mənim.* Qurbani. **Əziz olasan** – təşəkkür ifadəsi.

**ƏZİZCİYƏZ** "Əziz"dən *oxş. Telli arvad cavab verdi: – Kimin olacaq, sədrin əzizciyəzinin!* M.İbrahimov.

**ƏZİZ-ƏRKÖYÜN** *sif.* Naz-nemət içində böyümüş, çox ərköyün. *Əziz-ərköyün qız.*

*Əziz-ərköyün övlad.* – [Vahid] *əziz-ərköyün* (z.) *saxlanmış uşaqdır.* İ.Hüseynov.

**ƏZİZ-GİRAMİ** *sif.* [*ər.* əziz və *fars.* girami] Çox əziz, çox sevilən, çox əzizlənən, çox ərköyün. *Əziz-girami övlad.* – [Fatmanın] *belə əziz-girami oğlunun nişanlısı quru evə gəlməməli idi.* Mir Cəlal. // İs. mənasında. *Hər evin bir əziz-giramisi olduğu kimi, Nazlı da bu evin əziz-giramisi idi.* Ə.Əbülhəsən.

**ƏZİZ-XƏLƏF** *sif.* 1. B a x **əziz-ərköyün.** *Əziz-xələf övlad. Əziz-xələf qız. – Arvadın dar dünyada əziz-xələf bircə oğlu vardı.* "Koroğlu". *İlk dəfə idi ki, Sadıq kişi .. əziz-xələf oğlunun səsindəki həzin riqqəti görüb duyur, ürəyinin başı ağrıyırdı.* Mir Cəlal.

2. *dan.* Ən çox istənilən, çox əzizlənən, ən çox qorunulub saxlanılan. *Əziz-xələf palto. Əziz-xələf kitab. – Ovçunun tamamilə yaddan çıxardığı əziz-xələf tüfəngi də, nəhayət, yadına düşdü.* M.Rzaquluzadə.

**ƏZİZLƏMƏ** "Əzizləmək"dən *f.is. Bəlkə bu qədər əzizləmənin nəticəsi idi ki, uşağın canı sağ olmurdu.* Ə.Vəliyev.

**ƏZİZLƏMƏK** *f.* 1. Çox istəmək, nazını çəkmək, nazı ilə oynamaq, bütün istəklərini yerinə yetirmək, ərköyün böyütmək. *Mehriban isə* [Şərifəyə] *tam mənası ilə analıq etmiş, onu sevib əzizləmiş və böyütmüşdü.* S.Hüseyn. *Onda nə üçün anan səni belə əzizləyir?* Ə.Məmmədxanlı. *Ata-anası da, dayısı da Müşkünazın nazı ilə oynayar, onu əzizlər, üstündə zağ-zağ əsərdilər.* Ə.Vəliyev.

2. Hörmət etmək, böyük qayğı göstərmək.

3. Həddən artıq sevmək, müqəddəs bir şey kimi qoruyub saxlamaq. *Dostun məktubunu əzizləmək. Kitabı əzizləmək. – Qoydu əzizləyib isti qoynuna; Eşqin ərməğanı ad verdi buna.* M.Rahim. *Yaxın gəlmirdi ona paltarlar, qaş-daşlar da; Əzizlədiyi şeylər qoymuşdu onu darda.* N.Rəfibəyli.

**ƏZİZLƏNDİRMƏ** "Əzizləndirmək"dən *f.is.*

**ƏZİZLƏNDİRMƏK** "Əzizlənmək"dən *icb.*

**ƏZİZLƏNMƏ** "Əzizlənmək"dən *f.is. Uşağın əzizlənməsi.*

**ƏZİZLƏNMƏK** 1. *məch.* Çox istənilmək, əziz tutulmaq. // Hörmət edilmək, hörmətlə qarşılanmaq.

2. *məch.* Ərköyün böyüdülmək. *Uşaq çox əzizləndiyi üçün sözə baxmır.*

3. *qayıd.* Özünü istətməyə, sevdirməyə çalışmaq.

**ƏZİZLƏŞMƏ** "Əzizləşmək"dən *f.is.*

**ƏZİZLƏŞMƏK** *f.* Daha da əziz olmaq.

**ƏZİZLƏTMƏ** "Əzizlətmək"dən *f.is.*

**ƏZİZLƏTMƏK** *icb.* Əzizlənməsinə, ərköyünləşməsinə səbəb olmaq. *Uşağı əzizlətmək.*

**ƏZİZLİK** *is.* 1. Əziz olma, sevilmə, çox istənilmə. *Ananın əzizliyi.* // Müqəddəslik, mübarəklik. *Ana yurdunun əzizliyi. Bayramın əzizliyi.*

2. Ərköyünlük, naz-nemət. *Ağcanın uşaqlıq günləri beləcə şan-şərafətlə, əzizlik, bəxtiyarlıqla keçdi.* Mir Cəlal.

**ƏZQƏZA** *zərf.* [*fars.* əz və *ər.* qəza] Qəzadan, təsadüfən, gözlənilmədən, birdən. [Səttar] *üz çevirib bir biyabana daban aldı. Əzqəza Xunkar xanımın bunu axtaran adamları da bu düzlə gedirdilər.* (Nağıl). *Əzqəza Gülbadamın səsini kəndin kənarından bir adam eşidib səslənər: – Ay adam, kimsən?* N.Nərimanov.

**ƏZL** *is.* [*ər.*] *köhn. rəs.* İşdən çıxarma, vəzifədən kənar etmə. ☐ **Əzl etmək (eləmək)** – işdən, vəzifədən götürmək, çıxarmaq. [Şah:] *Mən ki o hakimi .. əzl eləmişdim.* Ə.Haqverdiyev. [Şah:] *..Mən səni sədarətdən əzl edirəm.* C.Cabbarlı.

**ƏZM** *is.* [*ər.*] Qəti niyyət, qəti qərar, qəsd. *Çox da vətən torpağı boyandı al qanına; Əzmimiz qorxu salmış düşmənlərin canına.* S.Rüstəm. // Qətiyyət, cəsarət, mətanət, iradə. *Əgər bizim iradə və əzmimiz möhkəm və sabit olarsa, zəmanəmizin həqiqi övladları ola bilərik.* M.İbrahimov. // Ümumiyyətlə, məqsəd, niyyət. *Təmaşayi-rüxün əzmilə çıxdı afitab, əmma..* Füzuli. *Ticarət əzmilə Hində gedərdi; Gecə-gündüz dincəlməyib sürərdi.* Q.Zakir. ☐ **Əzm etmək** – 1) *köhn.* müəyyən bir niyyət və qərarla yola düşmək, bir yerə üz tutub getmək. *Bakıya əzm etdi. – Çün qıldı vəsiyyətini axir; Əzmi-səfər etdi ol müsafir.* Füzuli. *Vərqa ona qıldı üzrxahi; Əzm etdigi yola dutdi rahi.* Məsihi. *Əzm elə Yevlaxa sən; Orda vaqonları gör.* Ə.Nəzmi; 2) qərara gəlmək, qəsd etmək, niyyət etmək. *Məcmuəni aprelin yeddisində nəşrə*

*qoymağa əzm etmişdik.* C.Məmmədquluzadə. **Əzm qılmaq** *köhn.* – b a x **əzm etmək**. *Tənha səfər ixtiyar qıldı; Əzmi-səri-kuyi-yar qıldı.* Füzuli. *Əzmi-çəmən qılıb bu gün ol sərv, qorxuram; Bərgi-hənavü gül dolaşa əl-ayağına.* Q.Zakir. *Əzm qıldım, güzar etdim; Mən sizin diyara gəldim.* Aşıq Hüseyn. **Əzmindən dönmək** – qərarından, niyyətindən, fikrindən daşınmaq, vaz keçmək, dönmək. *Yüksəlmək istərəm, əzmimdən dönməm! Qarşıma kim çıxsa enmək vəzifəm.* A.Şaiq. [Yaralı zabit:] *Bu xəbər düz də olsa, fərz edəlim; Bir mücahid dönərmi əzmindən?* H.Cavid. *Mirzağa məqsədinə doğru yürüməli, əzmindən dönməməli idi.* S.Hüseyn. **Əzmini toplamaq** – bir şeyi həyata keçirmək üçün qəti qərara gəlmək, iradəsini toplamaq. [Yunis] *özünü tufana düşmüş balıqçılar ilə müqayisə edib əzmini topladı.* Mir Cəlal.

**əzmlə** *zərf* Qəti niyyətlə, qətiyyətlə, səbatla, dönmədən. *Əzmlə irəli hərəkət etmək. Əzmlə məqsədə doğru getmək.*

**ƏZMƏ**[1] 1. "Əzmək"dən *f.is.*

2. Əzilmiş tərəvəz, ya meyvə xəmiri; püre.

3. Qara ciyər qiyməsindən hazırlanan bir xörək adı. *Əzməni plova qatıb yeyirlər.*

**ƏZMƏ**[2] *is. məh.* Bülöv. *Dəryazı əzmə ilə itiləmək.*

**ƏZMƏÇƏLƏMƏK** b a x **əzmələmək**. [Cavad bəy:] *..Ancaq bunu belə eşitmişəm ki, guya Məhəmməd kişinin qızı bəzən onu əzməçələyir.* N.Vəzirov.

**ƏZMƏK** *f.* 1. Basıb, ya sıxıb yastılamaq, şəklini pozmaq. *Qarpızı, qovunu əzmək.* // Basıb (vurub, toxundurub) bir yerini çökəltmək. *Samovarın, qazanın böyrünü əzmək.*

2. Həvəngdə və s.-də döyüb narın etmək, toz halına salmaq. *İstiotu həvəngdə əzirlər. – ...Kakao Amerikadan gələn ot toxumudur. Onu qabıqdan çıxarıb, qurudub, əzib kakao adı ilə satırlar.* H.Zərdabi. // Ovmaq, doğramaq. *Qızlar əkilmiş torpağın kəsəklərini əzir, alağını təmizləyir, cərgələrini hamarlayırdılar.* Ə.Vəliyev.

3. Hamarlığını, şaxlığını, düzlüyünü, yaxud ütüsünü pozmaq. *Paltarları əzmək. – Gördün pullarını əzib özünə qaytaranda nə kiridi?* "Koroğlu".

4. Basaraq, sıxaraq yumşaltmaq. *Mumu əzmək.*

5. *məc.* Darmadağın etmək, məğlub etmək. *Düşməni əzmək.*

6. *məc.* Döymək, kötəkləmək, əzişdirmək. [İsmayıl:] *Bəy onu bir az əzmişdisə, başa gəlmirdi.* Mir Cəlal. // Vurub yaralamaq. *Layiqmi lotular əzələr qardaşın başın?* C.Cabbarlı.

7. *məc.* Sarsıtmaq, yox etmək. *Köləlik yenə də Mahrunun iradəsini və şəxsiyyətini əzməmişdi.* M.S.Ordubadi.

8. *məc.* Mənəvi əzab vermək, əziyyət vermək, incitmək, narahat etmək. *Hər halda düşüncə məni əzirdi.* M.S.Ordubadi. [Musa Əşrəfə:] *..Sizə öylə bir cəza verməliyəm ki, bundan sonra hər kəsə ibrət olsun, .. gücsüzləri çeynəyib əzməsinlər..* H.Cavid.

◊ **Özünü əzmək** – naz-qəmzə etmək, özünü naza qoymaq, əzilib-büzülmək. **Əzib suyunu çıxartmaq** *məc.* – bərk sıxışdırmaq, incitmək, istismar etmək.

**ƏZMƏLƏMƏ** "Əzmələmək"dən *f.is.*

**ƏZMƏLƏMƏK** *f.* 1. Əli ilə əzmək, əzişdirmək.

2. *məc.* Döymək, kötəkləmək. *Ara yerdə uşağınızı o imansız belə əzmələdi.* S.Rəhimov.

**ƏZMƏLƏNMƏ** "Əzmələnmək"dən *f.is.*

**ƏZMƏLƏNMƏK** *məch.* Əllə əzilmək, əzişdirilmək.

**ƏZMKAR** *sif.* [*ər.* əzm və *fars.* ...kar] Əzmli, məqsəd və niyyətində qəti. [Məsmədə] *..əzmkar, səbatlı bir adamın hal və hərəkəti vardı və yaxud mənə elə təsir bağışlayırdı.* S.Hüseyn.

**ƏZMKARCASINA** *zərf* Əzmkara, əzmli adama layiq bir surətdə, əzmlə. *Əzmkarcasına hərəkət etmək.*

**ƏZMKARLIQ** *is.* 1. Məqsəd və niyyətində qətilik, möhkəmlik, əzmkar adamın hal və sifəti.

2. **Əzmkarlıqla** şəklində – b a x **əzmkarcasına**.

**ƏZMLİ** *sif.* Öz niyyət və məqsədində qəti, sabit, möhkəm və dönməz olan. *Əzmli adam.* – [Qadının] *zahiri gözəlliyindən daha dərin təsir edən qəti, cürətli, əzmli danışığı idi.* T.Ş.Simurq.

**ƏZRAİL** *is.* [*ər.*] 1. Dini etiqadlara görə, bütün insanların ölmək vaxtı çatanda onların canını alan mələk, ölüm mələyi. *Əzrail*

*gələndə soruşmaz ki, oğul-uşağın necədir?* (Ata. sözü). [Dərviş:] *..Əzrail hərdənbir qanadı ilə məni çaldığını anlayıram..* A.Divanbəyoğlu.

2. *məc.* Amansız, qəddar, əzazil, qorxunc adam haqqında. [Qurban:] *Amma* [Hafizəni] *çox əzrail arvad söyləyirlər.* Ə.Haqverdiyev. [Ağaxan:] *Bəydadaş, unutma ki, biz belə* [arvad kimi] *əzraillərlə bir yerdə yaşayırıq.* S.Rəhimov. [Meşədə] *bizim xanım və onun oğlu kimi əzraillər yoxdur..* M.İbrahimov.

**ƏZVAY** *is.* 1. *bot.* Qalın ətli və xətvari yarpaqları olan, təbabətdə işlədilən çoxillik ot-bitki; aloe. *Əzvay çoxillik tropik və ya subtropik bitkilərdən olub, yoğun, uzun və kənarı diş-diş* (*tikanlı*) *ətli yarpaqlara malikdir.* R.Əliyev.

2. Bu bitkinin yarpaqlarından alınan acı dadlı, qara və bərk maddə (xalq arasında dərman kimi işlədilir). *Əzvay bitkisinin yarpaqlarından alınan şirəni qurutduqda yaşılımtraq-qonur kütlə alınır. Ona əzvay deyilir.* M.Qasımov.

3. *məc. dan.* Acıdil, ətiacı adam haqqında. // Söyüş yerində işlənir. [Molla Fərəc:] *Ay Nəsir bəy, bu əzvay oğlu əzvay haradan gəldi, kefimizə soğan doğradı?* M.Əliyev.

4. *məc. məh.* Aciz, əlindən heç bir iş gəlməyən adam haqqında. *Əzvayın biridir.*

**ƏZVAYÇİÇƏKLİLƏR** *cəm bot.* Əzvay və s. ot və ağacların daxil olduğu bitki yarımfəsiləsi. *Əzvayçiçəklilər yarımfəsiləsi .. ot və ya ağaclardır. Çoxunun yarpaqları gövdəsinin uclarına toplanmışdır.* M.Qasımov.

**ƏZVAYİŞ** *is. dan.* Dolanacaq, yaşayış, vəziyyət. *Əzvayişi yaxşıdır. – Ancaq əzvayişi qolay gördüm, öz-özümə dedim*: *– Kişinin bu günündə nə dən-düş, nə taxıl?* S.Rəhimov.

**ƏZVAYLIQ** *is. dan.* 1. Diliacılıq, acıdillik.

2. Acizlik, maymaqlıq. *Əzvaylığından bu iş başına gəldi.*

**ƏZZƏL** b a x **əzəl**. *Mən də görmüşdüm on bir il əzzəl; Olduqca görkəmli, olduqca gözəl.* S.Vurğun.

**ƏZZƏLİ** b a x **əzəlcə**. *Arxalığın badamı; Gün yandırar adamı; Əzzəli özüm qurban; Sonra da kənd adamı.* (Bayatı).

**ƏZZƏLKİ** b a x **əzəlki**. [Hacı Mehdi:] *Birini qovub ayrısını tutursan, o, əzzəlkindən pis çıxır.* Ə.Haqverdiyev.

# Ff

**F** Azərbaycan əlifbasının səkkizinci hərfi. bax **fe**.

**FA** [*ital.*] Musiqi qammasının "do"dan başlayan dördüncü səsi; bu səsi ifadə edən not.

**FABRÍK** [*lat.* fabrica – emalatxana] Xammaldan maşınla müxtəlif məmulat hazırlanan sənaye müəssisəsi. *Tikiş fabriki. Fabrikin istehsalat planı. – Pambıq çoxaldıqca fabrik canlanır; Kollektiv güclənir, birlik canlanır.* M.Müşfiq. *Ehtiyat xala .. ipək fabrikində, boyaq-naxış sexində çalışırdı.* Mir Cəlal.

**FABRİKÁNT** [*lat.*] Fabrik sahibi olan fabrikçi.

**FABRİKÇİ** bax **fabrikant** [Mirağa:] *Mülkədar, fabrikçi və tacir zəhmət çəkmir.* Mir Cəlal.

**FABRİK-MƏTBƏX** [*lat.* fabrica və *ər.* mətbəx] Mexaniki üsulla çoxlu yemək hazırlanan iri ictimai iaşə müəssisəsi. *Qabaqcıl fabrik-mətbəx. Bakıda ilk fabrik-mətbəx 1930-cu ildə işə salınmışdır.*

**FÁBULA** [*lat.* fabula – təmsil, nağıl] 1. *ədəb.* Bədii əsərin qısa məzmunu, hadisələrin ardıcıl ifadəsi. *Romanın fabulası çox mürəkkəbdir.*

2. *hüq.* Cinayət hadisəsinin məzmunu.

**FACİƏ** *is.* [*ər.*] 1. Dəhşətli, ağır nəticəli hadisə, fəlakət, müsibət, bədbəxtlik. *Başına faciə gəlmək. Alkoqolizm faciə ilə nəticələnir. – Mirzağanın faciəsi ictimai bir faciə idi.* S.Hüseyn. [Şəndə:] *İnamı itirmək fəlakətdir və bir çox faciə də ondan doğur.* B.Bayramov.

2. *ədəb.* Həyatdakı barışmaz ziddiyyətlərdən, xarakterlərin, ehtirasların kəskin toqquşmasından və çox vaxt qəhrəmanın ölümü ilə nəticələnən əhvalatlardan bəhs edən dramatik əsər; tragediya. *N.Vəzirovun "Müsibəti-Fəxrəddin" faciəsi. Hüseyn Cavid faciənin kamil nümunələrini yaratmışdır. "Nadir şah" faciəsində N.Nərimanov feodalizm quruluşunda saray intriqalarının ən dəhşətli səhnələrini təsvir edir.* M.Arif.

**FACİƏLİ** *sif.* Faciə ilə dolu; müsibətli, faciəyə səbəb olan, faciə ilə nəticələnən; dəhşətli, fəci. *Alagöz öz daxili aləmi ilə bir cəzirə kimi yaşayan evdən qaçmış, həyatın faciəli səhnəsinə düşmüşdü.* S.Rəhimov. *Uşaq vəziyyətin ağır və faciəli olduğunu duyduğundan, böyük adam ciddiyyətilə səy edir, anası və bacısı ilə ayaqlaşmağa çalışır, onlara əlavə yük olmaq istəmirdi.* M.İbrahimov. // Adamı dəhşətə gətirən, dəhşətli, müdhiş, sarsıdıcı, çox ağır. *Faciəli ölüm. Müharibə faciəli epizodlarla doludur.*

**FAĞIR** *is.* və *sif.* [*ər.*] 1. Aciz, yazıq, məzlum; dinc, sakit. *Fağır kişi.* – [Nəbi pristav Mehdi bəyi görcək deyinir:] *Ə, bu fağırı niyə qəhr edirsən?* "Qaçaq Nəbi". [Hacı Qara:] *..Mən bir fağır adamam, peşəm sövdəgərlikdir.* M.F.Axundzadə.

2. Kasıb, yoxsul, tavanasız, miskin. *Fağıra kömək etmək. – Dağıdın fağırlara; Dövlətin, malın keşişin!* Aşıq Ələsgər. [Qulu:] *Adam fağıra pul verər, yetimə paltar alıb qarnını doydurar.* S.S.Axundov.

**fağır-fağır** *zərf* Yazıq-yazıq, məzlum-məzlum; fağırcasına. *Fağır-fağır oturmaq. – Mehriban fağır-fağır kişinin dalınca baxıb bir müddət qapını örtmədi.* H.Seyidbəyli.

**FAĞIRLAŞMA** "Fağırlaşmaq"dan *f.is.*

**FAĞIRLAŞMAQ** *f.* Acizləşmək, aciz olmaq, yazıqlaşmaq, əvvəlki ötkəmliyini, təşəxxüsünü itirmək, sakitləşmək. *Gəlin fağırlaşmışdı. O, bədnam olduğunu başa düşmüşdü.* B.Bayramov. // Yoxsullaşmaq, kasıblaşmaq, əli aşağı düşmək.

**FAĞIRLIQ** *is.* 1. Acizlik, yazıqlıq, məzlumluq.

2. Yoxsulluq, kasıblıq.

**FAĞIR-FÜQƏRA** *top.* [*ər.*] Cəmiyyətin aşağı, yoxsul təbəqələri, varı olmayanlar, kasıblar, yoxsullar. *Qoçular, quldurlar qatar taxırlar; Fağır-füqəraya yan-yan baxırlar.* Aşıq Ələsgər. [Hacı:] *Fağır-füqəraya əl tutmuşam.* Mir Cəlal.

**FAHİŞƏ** *is.* [*ər.*] Özünü pula satan, fahişəliklə məşğul olan qadın. // *məc.* Son dərəcə alçaq, prinsipsiz, satqın adam haqqında.

**FAHİŞƏXANA** *is.* [*ər.* fahişə və *fars.* ...xanə] Fahişələrin yaşadıqları və gələnləri qəbul etdikləri ev, mənzil.

**FAHİŞƏLİK** *is.* Qadınların özlərini pula satması. [Qətibə qəlbində Səba xanıma

acıqlanaraq:] *..Sən elə bilmə ki, tədbirli, bacarıqlısan.. Səni mənə üstün gətirən bir şey varsa, o da sənin fahişəliyindir.* M.S.Ordubadi.

**FAXİR** *sif.* [*ər.*] *köhn.* 1. Fəxr edən, öyünən, lovğalanan.

2. Gözəl, qiymətli, parlaq. *Hacı Kamyab libaslarının ən faxirini geyib Xudayar xanın vüruduna hazırlaşdı.* Ə.Haqverdiyev.

**FAİL** *sif.* [*ər.*] *köhn.* 1. İşləyən, edən.

2. Təsir edən.

3. *is.* Ərəb qrammatikasında feli sifət modeli.

**FAİZ** *is.* [*ər.*] 1. Hər hansı ədədin tam (vahid) kimi götürülən yüzdə biri (% işarəsi ilə göstərilir). *Sadə faiz düsturu.* – [Bəhlul:] *Nənəmin gözündə onca faiz işıq vardı.* B.Bayramov.

2. Kapitalın hər yüz manatından əldə edilən gəlir.

3. Borc verilən puldan istifadə etdiyi üçün borcludan (kreditordan) alınan haqq. [Hacı Vəli] *yüksək faiz alar və girovsuz da pul borc verməzdi.* Çəmənzəminli. *Hacı Kərim hər zaman alış-verişini nağd elər, faizini də verəcəyi puldan çıxardı.* S.Hüseyn.

4. Dövriyyədən, gəlirdən asılı olaraq hesablanan muzd. Faiz dərəcəsinin həddi.

5. Məhsulun kəmiyyətinə görə faiz almaq.

◊ **Yüz faiz** – tamamilə, bütünlüklə. *Planı yüz faiz yerinə yetirmək.* – [Fərman dedi:] *Normanı yüz faiz yerinə yetirmək hər kəsin borcudur.* Ə.Sadıq.

**FAİZLİ** *sif.* Faiz verən, faiz (gəlir) gətirən. *Faizli istiqraz.*

**FAİZSİZ** *sif.* Üstünə faiz gəlməyən, faizi olmayan, faizlə gəlir verməyən. *Faizsiz istiqraz. Faizsiz borc.*

**FAKS** *is.* [*ing.*] 1. Elektron rabitə cihazı.

2. Qrafik məlumatın qəbulu və verilməsi üsulu.

**FAKSİ́MİLE** [*lat.*] 1. Əlyazması, sənəd, imza və s.-nin fotomexaniki reproduksiya yolu ilə çıxarılmış dəqiq surəti. *Faksimile şəklində çap olunmuş əsər. Əlyazmasının faksimilesi.*

2. Birinin əli ilə çəkilmiş imzasını təkrarlamaq üçün klişe-möhür. *Süleyman xəlvətcə ... faksimileni yerə salır.* M.İbrahimov.

**FAKT** [*lat.* factum – edilmiş, baş vermiş] 1. Həqiqətən olmuş hadisə, əhvalat, qəziyyə. *Bu deyilənlər uydurma deyil, faktdır.* – *Hər kəs bildiyi faktı deyir, üçlükdə müzakirə edib o birinə keçirdilər.* B.Bayramov. // Nümunə, misal. *Faktı geriyə qalmışlardan deyil, qabaqcıllardan götürmək lazımdır.* Ə.Vəliyev. // Bir nəticəyə gəlmək, bir işə yekun vurmaq və ya bir ehtimalın, fərziyyənin düzgünlüyünü müəyyən etmək üçün əsas olan şey; dəlil. [Prokuror:] *Qanun fakt tələb edir.* C.Cabbarlı.

2. Gerçəklik, reallıq, həqiqət, olub-bitmiş şey. *Sübut olunmuş fakt. İnkaredilməz fakt.* – *Beləliklə, Naşad əfəndi öz məqsəd və məramına nail olmuş, Zeynal bir fakt olaraq Mehribanı boşamışdı.* S.Hüseyn. [Məşədibəy rəisə:] *Mənim dövlətdən narazılığımı hansı əsasa görə sübut olunmuş bir fakt hesab edirsiniz.* M.Hüseyn.

**FAKTİ́K** *sif.* [*lat.*] Gerçək, həqiqi, faktlara əsaslanan. *Faktik vəziyyət.*

◊ **Faktik nikah** *hüq.* – qanunun müəyyən etdiyi qaydada qeyd olunmamış nikah.

**FAKTOQRÁFİYA** [*lat.* factum və *yun.* grapho – yazıram] *kit.* Faktların (olmuş hadisələrin) təhlil edilmədən, ümumiləşdirilmədən və ya bədii cəhətdən işlənilmədən təsvir edilməsi.

**FÁKTOR** [*lat.* factor – edən, düzəldən] Hər hansı prosesin, hadisənin gedişini şərtləndirən moment, fakt; amil.

**FAKTÓRİYA** [*lat.*] 1. Avropa tacirlərinin müstəmləkə ölkələrində ticarət kontoru və yaşadıqları yer.

2. Ucqar ovçuluq rayonlarında ticarət və təchizat məntəqəsinin adı. *Şimalda xəzli heyvan faktoriyası.*

**FAKTÚRA** [*lat.* factura – quruluş] 1. *xüs.* İncəsənət əsərlərində bədii üsulun xüsusiyyəti. *Şerin fakturası. Simfoniyanın fakturası.*

2. *xüs.* Hər hansı bir materialın (məs.: parçanın, şüşənin və s.-nin) zahiri görünüşünü müəyyən edən emal üsulu.

3. Alıcıya göndərilən və ya buraxılan malların növünü, miqdarını, qiymətini müfəssəl surətdə göstərən siyahı. [Sədr:] *Xahiş edirəm ki, tez onun fakturasını alıb,*

*haqq-hesabın göndərin ki, o kişilərə işimiz çox düşür.* Mir Cəlal.

**FAKULTATÍV** *sif.* [*fr.*] Məcburi olmayan, könüllü, öz arzusu ilə seçilən. *Mühazirələrin fakultativ kursu.*

**FAKÜLTƏ** [*alm.*] Ali məktəblərin tədris obyektinə görə bir-birindən ayrılan şöbələrindən hər biri. *Kimya fakültəsi. Hüquq fakültəsinin dekanı.* – [Həsən] *riyaziyyat fakültəsinə .. daxil oldu.* İ.Əfəndiyev.

**FAQÓT** [*ital.*] Konusvari kanalı və ikiqat qamış dilçəyi olan, nəfəsli musiqi aləti. *Faqotun konusvari gövdəsi. Faqot ağcaqayından düzəldilir.*

**FAL**[1] *is.* [*ər.*] 1. Falçıların noxuda, suya, güzgüyə, kitaba və s.-yə baxmaqla gələcəkdən və ya keçmişdən xəbər verməsi. *Fala inanma, falsız da qalma.* (Məsəl). *Fal göstərirdi ki, dan ulduzunun karvanqıran ilə ötüşüb qovuşmağı gözlənir.* Mir Cəlal. ☐ **Fal açmaq, fala baxmaq** – noxuda, suya, güzgüyə, kitaba və s.-yə baxmaqla gələcəkdən və ya keçmişdən xəbər vermək. *Şeyx Şabanın arvadı Gülsüm xala da məhəllədə məşhur idi, çünki yaxşı ruh tutardı, çöp ötürərdi, noxud falı açardı və hacəmət qoyardı.* Ə.Haqverdiyev. [Gülər:] *Qoy bir fala baxım, görək bizim getməyimiz uğurlu olacaq, ya yox?* S.Rəhman. **Qulaq falı** – təsadüfən eşitdiyi söhbətdən nəticə çıxarmaqla fala baxma. *Axşam Hacı evdə ikən Kəblə Xeyransa xanım əlinə bir ayna götürüb küçə qapısına qulaq falına gedir.* H.Sarabski.

2. *məc. klas.* Bəxt, tale. *Açıram məshəfi yüz dəfə, əlif-lam gəlir; Qamətü zülfdə, ey dil, nə gözəl falın var.* S.Ə.Şirvani. *Koroğlu bu işi yaxşı fal hesab eləyib çox sevindi.* "Koroğlu".

**FAL**[2] *is.* Toyuğun başqa yerdə deyil, müəyyən olunmuş yerdə yumurtlaması üçün ora qoyulan yumurta. *Yumurtlamadı, yumurtlamadı, falını bəs neylədi?* (Ata. sözü). [Şahpəri:] *Bu qıza yüz dəfə demişəm ki, toyuğa fal qoy, yenə də yadından çıxarır.* B.Bayramov.

**FAL**[3] *is.* Dilim. *Bir fal çörək.*

**FAL**[4] *is.* [*holl.*] Yelkəni qaldırmaq üçün istifadə edilən kəndir.

**FALABAXAN** b a x **falçı**.

**FALAQQA** *is.* Molla məktəblərində şagirdləri cəzalandırmaq üçün işlədilən alət. *Kimisi dərs oxuyur, kimisi falaqqadan təzə çıxmış ayaqlarını ovuşdurub ağlayır..* Ə.Haqverdiyev. [Əmiraslan:] *Dədə, mən məktəbə getməyəcəyəm. Orada molla adamın ayağını falaqqaya salıb döyür.* S.S.Axundov. // Ümumiyyətlə, keçmişdə müqəssirləri cəzalandırmaq üçün tətbiq edilən eyni alət və üsul. *Əhmədi yıxıb, ayaqlarını qoydular falaqqaya, o qədər döydülər ki, ayağının bir qat qabığı getdi.* (Nağıl).

**FALÁNQA** [*yun.*] 1. Fransız utopik sosialisti Şarl Furyenin (1772-1837) layihəsində: ideal cəmiyyətin ilkin özəyi olan əmək icması, kollektiv təsərrüfat.

2. Franko İspaniyasında hakimiyyət başında olmuş faşist partiyasının adı.

**FALANQAÇI** *is.* Falanqa üzvü (b a x **falanqa** 2-ci mənada).

**FALÇI** *is.* Falabaxan, fal açmaqla, falçılıqla məşğul olan adam. *Falçı falçıya fənd vurmaz.* (Ata. sözü). *Xanbibim falçı, nənəm bağtoxuyan; Bizdə, haşa, yox idi bir oxuyan.* M.Ə.Sabir. // Sif. mənasında. *Gəzir qapıları falçı qadınlar; Bəşər taleyini həll edir onlar!* S.Vurğun.

**FALÇILIQ** *is.* Falçının işi, peşəsi. [Yarməmməd] *atasının mollalığını, anasının falçılığını gizlətdiyi üçün onu maarif şöbəsindən qovmuşdular.* M.İbrahimov.

**FAMİ́LİYA** *is.* [*lat.*] 1. Atadan (bəzən də anadan) övladlarına keçib şəxs adlarına əlavə edilən nəsli, ailəvi ad. *Qızlıq familiyasını saxlamaq. Familiyasını dəyişmək.* – *Teymurun dindirdiyi sürücünün familiyası Cüməzadə idi.* H.Seyidbəyli.

2. Nəsil, qohum-əqrəba. *Şükür öyrəndi ki, bu kənddə bir-birilə qanlı iki familiya vardır.* S.Hüseyn. // Ailə, ailə üzvləri.

**FAMİLİYALI** *sif.* Familiyası olan, müəyyən familiya daşıyan.

**FANÁTİK** [*lat.* fanaticus – azğın] 1. Dindarlığı həddini aşaraq, başqa dinlərə düşmən münasibət bəsləyən adam; qatı mövhumatçı. *Bağdad Şərq dünyasını təmsil edən əfsanəvi bir şəhər kimi, öz fanatik cah-cəlalı ilə bütün dünyanı heyrətə saldı...* Ə.Məmmədxanlı.

2. Hər hansı bir işə və ya əqidəyə, məsləkə həddindən artıq sadiq olan adam; təəssübkeş. *Öz işinin fanatiki.* – [Bəkir:] *Bura bax, heç olmasa bu gecə işləmə, ay yoldaş fanatik.* İ.Hüseynov.

**FANATÍK** *sif.* [*lat.*] Fanatizm mahiyyətində olan; mütəəssib. *Fanatik adamlar. Fanatik görüşlər.*

**FANATİZM** [*lat.*] Fanatik adamın düşüncə və hərəkət tərzi; başqa etiqadlara düşmən münasibət bəsləyib öz inandığına hədsiz sədaqət göstərmə, sevmə, öz əqidəsinə qeyri-adi sədaqət; təəssübkeşlik. // Mövhumatçılıq. *Fanatizmlə mübarizə.*

**FANÉR** *is.* [*alm.*] 1. Yaraşıq üçün taxta şeylərin üzünə yapışdırılan nazik taxta təbəqəsi.

2. Çarpaz yapışdırılmış bir neçə təbəqə nazik ağac qatından ibarət taxta növü. *Faner lövhələrin qalınlığı. – Kamal özünə qəribə bir kirşə qayırmışdı, onun yanlarına nazik fanerdən təyyarədə olduğu kimi iki qanad vurmuşdu.* M.Rzaquluzadə. // Həmin materialdan qayrılmış, düzəldilmiş. *Faner qapı.*

**FANİ** *sif.* [*ər.*] Həmişəlik olmayan, axırı puç, axırı olmayan; müvəqqəti, keçici, qalmayan. *Dost tutma dünyanı, fanidir, fani; Aldanıb özünü xar eyləməynən.* Aşıq Ələsgər. *Ey bizə fani cahanın dövlətindən dəm vuran; İstəyirsən, bizlərə cənnətdə qılman gülməsin?* Ə.Qəmküsar.

**FANİLİK** *is. klas.* Axırı puçluq, zaval, yox olma, müvəqqətilik, keçicilik. [Vaqif:] *Hər şey fani də olsa, faniliyin qəlb, şüur və ağıl kimi gözəl rəhbərləri var.* Çəmənzəminli.

**FANTÁST** [*yun.*] 1. Xəyalpərəst, fantaziyaçı.

2. *ədəb.* Fantastik süjetləri təsvir etməyə daha çox meyil göstərən yazıçı, sənətkar.

**FANTASTİK** *sif.* [*yun.*] 1. Fantastikaya əsaslanan, fantastik mövzuda olan; xəyali. *Fantastik roman. Fantastik süjet xətti. Fantastik əsər.*

2. Əcaib, qəribə, əfsanəvi, ecazkar. *Fantastik mənzərə. Fantastik görünüş.*

**FANTÁSTİKA** [*yun.*] 1. Xəyalda yaranan fikirlər, təsəvvürlər, surətlər; xəyali təsəvvür, gerçəkliyin mübaliğəli və ya fövqəltəbii şəkildə təsviri. *Elmi fantastika. Yazıçı fantastikası. // top. dan.* Hadisələrin şişirdilmiş və ya fövqəltəbii şəkildə təsvir olunduğu bədii əsərlər. *Jül Vernin fantastikası.*

2. Həqiqətən mövcud olmayan, qeyri-real, xəyal kimi görünən şey. *Keçmiş fantastika indi həqiqətə çevrilir.*

**FANTÁZİYA** [*yun.* phantasia – xəyal] 1. Xəyalən bir şey uydurma, təsəvvür etmə bacarığı, yaradıcılıq təxəyyülü. *Yazıçı fantaziyası. Rəssamın fantaziyası. – Dastanlar xalq fantaziyasının məhsuludur.* M.Hüseyn. // Xəyal, təxəyyül məhsulu. *Bu onun fantaziyasıdır.* // Xam xəyal.

2. *mus.* Sərbəst formalı improvizasiya səciyyəli əsər. *Orkestrlə fortepiano üçün yazılmış fantaziya.*

**FANTAZİYAÇI** bax **fantast** 1-ci mənada.

**FÁNUS** *is.* [*yun.*] Fənər. *Ər-arvad bir-birinə qoşulub, fanus əllərində axşam getdilər qazının yanına.* Çəmənzəminli. *Gecənin qaranlığında küçələr nökərlərin saxladığı böyük fanuslarla işıqlanmışdı.* M.S.Ordubadi.

**FÁRA** [*fr.*] Yolu işıqlandırmaq üçün avtomobillərdə, traktorlarda və s.-də reflektoru olan fənər. *Avtomaşının farası. Motosikletin farası.* – [Yarməmməd Naznaza:] *Gördüm qabaqda, məktəb bağının ətəyində, çəpərin dibində bir şey işıldayır. Lap üçtonluq maşının faraları boyda bir şey.* M.İbrahimov.

**FARAĞAT** *sif.* və *zərf* [*ər.*] 1. Sakit, səssiz, dinməz-söyləməz. *Birdən Məcid Səmədə sarı dönüb, divar uzunu farağat oturmuş adamlara işarə etdi.* İ.Hüseynov // **Farağat!** – hərəkətsiz, düz, sakit, səssiz durmaq haqqında hərbi komanda. *..Nəriman əmi birdən qəddini elə gümrahlıqla düzəltdi ki, elə bil farağat komandasında duracaqdı.* İ.Əfəndiyev. *Keşikçi .. farağat vəziyyətində durdu.* Ə.Əbülhəsən.

2. Asudə, sakit, dinc, xatircəm. *Farağat yaşamaq.* // Sakit, dinc, yazıq, fağır. [Hacı Qara:] *A qardaş, mən dinc, farağat, kəsb əhliyəm.* M.F.Axundzadə. // Asudə, arxayın. [Hacı Kərim zərgər:] *Hacı Nuru, hələ şeir oxumaq vəqti deyil. Bir özgə farağat vəqtdə oxuyarsan.* M.F.Axundzadə. ☐ **Farağat etmək (eləmək)** – yerbəyer etmək, rahatlamaq. [Gülsüm:] *Dana gəlib, yemləmişəm, o*

*biriləri də fərağat elərəm, sən arxayın ol, işini gör.* C.Cabbarlı.

◊ **Farağat oturmaq** – dinc oturmaq, heç kəslə işi olmamaq, pis işlərdən əl çəkmək. [Camal bəy:] *..Ağa İsmayıl bəy, farağat otur, bəsdir şərarət.* N.Vəzirov. [Şahpəri:] *Sənə dedimmi, yetim oğlansan farağat otur?* B.Bayramov.

**FARAŞ** *sif.* və *zərf* [*ər.*] Vaxtından, mövsümündən qabaq, tez əkilən. *Faraş əkin.* – *Aqronomlar deyirlər ki, faraş səpin yaxşı olur.* Ə.Vəliyev. *Faraş səpilmiş reyhan iyi adamı valeh edir.* Mir Cəlal. // Mövsümündən, vaxtından qabaq doğulan (ev heyvanları haqqında). *Faraş balalar isə hər gün çimizdirilməli və sərinlikdə saxlanmalıdır.* // Tezyetişən, tezböyüyən. *Faraş kələm. Faraş göyərti.* – [Gülşən] *manqa üzvlərinə altdan-altdan baxıb, kimin nə cür işlədiyinə ciddi nəzər saldıqdan sonra faraş bir kolun yanına gəldi.* Ə.Vəliyev. *Bir səs deyir*: – *Rza, durma! Rza, yaz! Qırçın tarla, faraş qoza, bol pambıqlı yaza yaz!* R.Rza.

◊ **Faraş gəlmək** – 1) vaxtından qabaq özünü göstərmək, havaların qızışması (əsasən yaz mövsümü haqqında). *İl faraş gəlsə, yaylaqda ot, qışlaqda güzdək və xəsil bol olsa, qoyun saxlamaq asandır.* Ə.Vəliyev. *Yaz da bu il dağ ətəyinə faraş gəlmişdi.* B.Bayramov; 2) sürətlə inkişaf etmək, gözlənildiyindən tez böyümək. *Muğanın pambığı faraş gələndə; Qozalar gül açıb üzə gülərdi.* S.Vurğun.

**FARİNGİ́T** *is.* [*yun.*] *tib.* Udlağın selikli qişasının iltihabı. *Kəskin faringit. Xronik faringit.*

**FARMAKOLÓGİYA** [*yun.* pharmakon – dərman və logos – elm] Dərman maddələrinin orqanizmə təsiri haqqında elm. *Eksperimental farmakologiya. Ümumi və xüsusi farmakologiya. "Farmakologiya və toksikologiya" jurnalında farmakologiya sahəsindəki tədqiqatlar nəşr olunur.*

**FARMAKOLOJİ** *sif.* Farmakologiyaya aid olan, farmakologiya ilə əlaqədar olan. *Farmakoloji tədqiqat.*

**FARMAKÓLOQ** [*yun.*] Farmakologiya mütəxəssisi. *Farmakoloqların elmi cəmiyyəti.*

**FARMAZON** *is.* və *sif.* [əsli "frankmason" sözündən olması güman edilir] 1. Ədalı, ədabaz.

2. Azad, nihilist.

**FARS**[1] *is.* İranın əsas əhalisini təşkil edən və həmin adlı dildə danışan xalq və bu xalqa mənsub adam. *Farslar islama qədər zərdüştlüyə etiqad edirdilər.*

**FARS**[2] *is.* [*fr.*] Yüngül komediya.

**FARSCA** *sif.* və *zərf* Fars dilində. *Farsca danışmaq. Farsca-azərbaycanca lüğət.* - *Məktubu farsca yazsan, xalqın başa düşmədiyi şəkildə yazma, yaxşı deyil, xüsusilə, məlum olmayan söz işlətmə.* "Qabusnamə".

**FARSÇILIQ** *is.* Fars dili və mədəniyyətini zorla fars olmayanlara qəbul etdirməyə çalışmaqdan ibarət şovinist siyasət.

**FARSİ** *is.* [*fars.*] Fars dili. *Süheyli çörək yeyən qardaşlarına sarı getdi. Onlar nə isə pıçıldaşırdılar*: – *Farsini kamil bilirsənmi?* M.İbrahimov.

**FARSLAŞDIRMA** *f.is.* İran şovinistlərinin qeyri-fars xalqları dil və adətcə zorla fars etmək siyasəti.

**FARSLAŞDIRMAQ** *f.* Fars olmayan xalqları dil və adətcə zorla fars etmək.

**FARSLAŞMA** "Farslaşmaq"dan *f.is.*

**FARSLAŞMAQ** *f.* Fars dili, ənənə və adətlərini qəbul etmək; fars olmaq.

**FASÁD** [*fr.*] Binanın çölə baxan əsas qabaq tərəfi; ön tərəf. [Fazilov:] *Harası xoşa gəlmir?* [Arxitektor:] *Xüsusən qabağı, fasad tərəfi.* Mir Cəlal. [Elçin Sevincə:] *..Fasad ağ daşdan olacaq..* Z.Xəlil. // Binanın, hər hansı bir tikilinin üz, bayır tərəfi. *Bir çox arxitektorlar işin zahiri tərəfinə uyaraq başlıca olaraq binaların fasadlarını bəzəməklə məşğul olurlar..* (Qəzetlərdən).

**FASİD** *sif.* [*ər.*] *köhn.* 1. Pozğun, pozulmuş. *Deməm ki, fasidi vəsf et, sakın fəsadından! Yamanə yaxşı demək nasəza deyil də, nədir?* Ə.Vahid.

2. Fitnə-fəsadçı, araqarışdıran.

**FASİQ** *is.* [*ər.*] 1. Günah işlərlə məşğul olan adam; dinsiz. [Quşbazoğlunun] *Allahı da, dini də pul, dövlət və zülm idi. Həm də çox hiyləgər və fasiq adam idi.* "Qatır Məmməd". [İbrahim:] *Ayağıma dəmir çarıq geyib, əlimə dəmirdən əsa alıb, tamam Yer*

*üzünü dolanıb deyəcəyəm: – Ağa adını müctəhid qoyub, amma yalançıdır, fasiqdir.* Ə.Haqverdiyev.

2. Məlun, böhtançı, fitnəçi, araqarışdıran. [Din alimlərinin xüsusiyyəti:] *Yaxşı ad qazanmaqda şöhrət tapmalı, fasiq adamı günah üstündə, xüsusilə, xalq içində danlamamalıdır.* "Qabusnamə".

**FASİLƏ** *is.* [*ər.*] 1. İşin, fəaliyyətin müvəqqəti dayandırılması; işin, fəaliyyətin müvəqqəti dayandırıldığı, ara verdiyi vaxt, müddət. *Murad bir anlıq fasilədən sonra davam etdi.* İ.Əfəndiyev. *Dilbər nahar fasilələrində kolxozçulara qəzet oxuyur, ictimai və siyasi mövzularda söhbətlər edirdi.* Ə.Sadıq. // Bir işin qurtarması və başqa işin başlanması arasındakı qısa vaxt, müddət. *Bədii özfəaliyyət dərnəklərinin müsamirəsi başlanmazdan əvvəl fasilə elan edildi.* S.Rəhimov.

2. Tənəffüs, aravermə. "*Marselyoza*" *və başqa mahnıları bilən yoldaşlarımız dərslərin arasındakı fasilələrdə sinfin qapısını bağlayıb, mahnı oxuyur, biz də onlarla xor təşkil edirdik.* T.Ş.Simurq. ☐ **Fasilə vermək** – ara vermək, işi, fəaliyyəti arada saxlamaq, dayandırmaq; tənəffüs vermək. *İşə bir qədər fasilə vermək lazımdır.*

3. Məsafə, ara. *Amma* "*Həblülmətin*" [qəzeti] *bunu görmür və bilmir, ondan ötrü ki, Osmanlı ilə Kəlkətənin fasiləsi çoxdur.* C.Məmmədquluzadə.

**FASİLƏLİ** *sif.* və *zərf* Fasilə ilə olan, arası kəsilən, fasilə verilən, ara verilən. *Fasiləli dərs prosesi. Fasiləli iş günü.*

**FASİLƏSİZ** *sif.* və *zərf* Arada fasilə olmadan, fasilə vermədən, ara vermədən, arasını kəsmədən, arası kəsilmədən. *Fasiləsiz tamaşa. Fasiləsiz işləmək. – Fatı birdən ətini kəsirlərmiş kimi fasiləsiz qışqırdı.* Ə.Abasov.

**FASİLƏSİZLİK** *is.* Arasıkəsilməzlik, ara vermədən davam etmə, aramsızlıq.

**FASÓN** [*fr.*] 1. Ülgü, biçim, model (paltarda, ayaqqabıda və s.-də). *Köhnə fasonda paltar.* – [Şahnaz:] *Elə nazik paltarlar tikdirmişəm ki, baxanda adamın ağlı gedir. Hamısı da təzə fason.* İ.Şıxlı.

2. *məc.* Fors, əda, təşəxxüs, şıq. *Onun fasonuna bax!*

**FASONLU** *sif.* 1. Müəyyən fason (ülgü, biçim, model) üzrə hazırlanmış, tikilmiş, düzəldilmiş. *Fasonlu saç. Fasonlu tufli.*

2. *məc.* Ədabaz, təşəxxüslü, ədalı, bəzəkli-düzəkli, şıq.

**FAŞ** *sif.* [*ər.*] Meydana çıxan, zahir olan, üstü acılan, ifşa olunan, büruzə çıxan. ☐ **Faş etmək** – gizli işi, sirri başqalarına demək, bildirmək, yaymaq, açmaq, üzə çıxarmaq, üstünü açmaq. *Gizli xəbəri faş etmək.* – ["Molla Nəsrəddin"] *Yer üzündə Allah vəkillərinin çirkin əməllərini faş edirdi.* M.İbrahimov. *Saldın ayaqlara məhəbbətimi; Faş etdin aləmə hər söhbətimi.* S.Rüstəm. [Zeyd Nofələ və İbn Salama:] *Qayıdın geri. Qeysin sirri var. Qoymaram onun sirrini faş edəsiniz.* Ə.Məmmədxanlı. **Faş olmaq** – üzə çıxmaq, üstü açılmaq, hamıya məlum olmaq, aşkar olmaq, yayılmaq. *Dildən-dilə düşdü bu fəsanə; Faş oldu bu macəra cəhanə.* Füzuli.

**FAŞÍST** [*ital.*] Faşizm tərəfdarı. *Faşistlərin törətdikləri cinayətlər. – Faşist adlı məxluqun yoxdur qəlbi, vicdanı.* M.Rahim. *Faşistlər* [dustaqların] *güllələnəcəyi haqqında kənddə divarlara elanlar yapışdırmışdılar.* Ə.Sadıq. // Sif. mənasında. *Faşist nişanı. Faşist rejimi. – İndi hücumçular hücuma keçir; Faşist soldatları ot kimi biçir.* M.Rahim. *Kamal təyyarəni döndərib faşist quzğunu ilə üz-üzə, göz-gözə gəlməyi qət etmişdi.* M.Rzaquluzadə.

**FAŞÍZM** [*ital.* fascismo – dəstə, birləşmə] 1. İtaliyada 1922-1943-cü illər arasında mövcud olan və imperialist burjuaziyanın ən təcavüzkar dairələrinin mənafeyini ifadə edərək dövlət sərhədlərini genişləndirməyi qarşısına məqsəd qoyan, hakimiyyətin tək bir partiyanın əlində toplandığı rejim, açıq terrorçuluq diktaturası. *Vuruşan xalq, qalib gələn xalq .. faşizm kabusunu Yer üzündən silib məhv etmədikcə öz tarixi vəzifəsini bitməmiş sayacaqdır.* M.Hüseyn.

2. Demokratik azadlıqlara son qoyaraq yerinə qatı şovinizm, irqçilik gətirən və avtoritar sistem yaratmaq məqsədi güdən siyasi cərəyan.

**FATA** *is.* [*lat.*] Duvaq.

**FATALÍST** [*lat.* fatalis – tale, qismət] Qəzavü-qədərə, olacağa, taleyə, qismətə inanan adam.

**FATALÍZM** [*lat.*] Qəzavü-qədər, taleyə inanan. *Fatalizm ideyası. Teoloji fatalizm.*

**FATEH** *is.* [*ər.*] 1. Bir məmləkəti, ölkəni tutan, ölkələr fəth edən, işğal edən şəxs. [İskəndər:] *Ad-sanım dünyada bilinsin gərək! Fatehlər tarixdən silinsin gərək!* A.Şaiq. *Qılınc çalan min bir fateh ad qoymadı heç bu yerdə.* N.Rəfibəyli.

2. *məc. tənt.* Mübarizə, inad, böyük zəhmət və s. yolu ilə bir şeyi əldə edən, bir şeyə nail olan. *Xam torpaq fatehləri.*

**FATİHƏ** *is.* [*ər.*] Quranın ilk surəsi. *Fatihə vermək.*

◊ ...**Fatihəsi oxunub** *məc.* – Bir şeydən ümidin kəsildiyi məqamda işlənir.

**FATMANƏNƏ: Fatmanənə qurşağı (xanası)** – b a x **göy qurşağı** (“**göy**”də).

**FÁUNA** *is.* [*lat.*] Hər hansı bir ərazinin və ya geoloji dövrün heyvanlar aləmi, bütün heyvan növləri; heyvanat aləmi. *Səhra faunası. Abşeronun faunasını tədqiq etmək. – Dənizlərin əmələ gəlməsi tarixi başqa-başqadır. Buna görə qonşu dənizlərin faunası çox vaxt müxtəlif olur.* “Sualtı aləm”.

**FAY**[1] *is.* [*fr.*] Köndələn və incə zolaqları olan sıx ipək və ya yun parça. *5 metr fay.* – [Əminə] .. *qəşəng al faydan kofta geymiş, başına da heyratı kəlağayı örtmüşdü.* Ə.Əbülhəsən. // Həmin parçadan tikilmiş. *Fay paltar.*

**FAY**[2] [*fr.*] *geol.* Süxurların tektonik qırılma yerdəyişməsi növlərindən biri. *Faylar, əsasən, dartılma şəraitində əmələ gəlir.*

**FAYDA** *is.* [*ər.*] Xeyir, mənfəət. [Hacı Qara:] *Yaxşı, sizə verdiyim pulun faydası necə olsun?* M.F.Axundzadə. // *məc.* Xeyir, nəticə. [Kərbəlayı Həsənə:] *Ay balam, axı məni burada saxlamaqdan nə fayda olacaq, pulum yoxdur ki, verim.* Çəmənzəminli. ◻ **Fayda verməmək** – xeyri, faydası, nəticəsi olmamaq. *Qoçoğlu tapılmır, o, çıxmış yoxa; Bir fayda vermədi uzun axtarış.* A.Şaiq.

**FAYDALANMA** “Faydalanmaq”dan *f.is.*

**FAYDALANMAQ** *f.* Fayda götürmək, xeyir götürmək, istifadə etmək, bəhrə götürmək. *Zəhmətdən faydalanmaq. – İnsan faydalanmış onun hər əməlindən; İnsanpərvər alimin bu polad heykəlindən.* B.Vahabzadə.

**FAYDALI** *sif.* Fayda, xeyir verən, xeyirli, yaxşı nəticə verən. *Faydalı təklif. Faydalı məsləhət.* – [Məsmə:] *Axırda onu xəstəxanaya yerləşdirmək fikrinə düşdüm, orada daha faydalı müalicə edilərdi.* S.Hüseyn. *Sənət əsəri həyatı düzgün əks etdirməklə bərabər, özündə yüksək və faydalı bir məna daşımalıdır.* M.Arif.

**FAYDALILIQ** *is.* Faydalı, xeyirli, səmərəli olma; xeyirlilik, səmərəlilik.

**FAYDASIZ** *sif.* və *zərf* Heç bir faydası, xeyri, nəticəsi olmayan; səmərəsiz, xeyirsiz, nəticəsiz. [Tahirin] *fikrincə, hər addımda xudpəsəndliyə qapılmaq, .. narazılıq eləmək faydasız bir işdi.* M.Hüseyn. *Ataş burada dayanıb Hürü ilə uzun-uzadı danışmağı faydasız hesab eləyib, axırıncı sözünü dedi.* Ə.Vəliyev.

**FAYDASIZLIQ** *is.* Faydası, xeyri, nəticəsi, səmərəsi olmama; xeyirsizlik, səmərəsizlik.

**FAYDEŞÍN** [*fr.* faille de Çhine – Çin fayı] Yüksəknövlü ipək parça, fayın növlərindən biri. // Həmin parçadan tikilmiş. *Faydeşin paltar.*

**FAYTÓN** [*yun.* əfsanəvi addan] 1. Üstü açılıb-örtülən dörd bucaqlı at arabası. [Dilbər:] *Mən həmişə oradan evə faytonla gəlirdim.* C.Cabbarlı. [Telli:] *Səni yaxşıca geyindirirlər, bəzəyirlər, sonra faytona mindirib Allah-Allah ilə aparırlar.* Ü.Hacıbəyov.

2. Açıq kuzovlu yüngül avtomobil.

**FAYTONÇU** *is.* 1. B a x **faytonsürən**. *Faytonçuların bir hissəsi müsəlman idi..* Ə.Haqverdiyev. *Bu çinarın dövrəsi yay fəslində buradan ötüb-keçən arabaçıların, faytonçuların düşərgə yeri olmuşdu.* S.Rəhimov.

2. Fayton qayıran usta.

**FAYTONÇULUQ** *is.* Faytonla aparıb-gətirən şəxsin sənəti. *Faytonçuluq etmək.* – [Arazın atası] *..yoxsul bir kəndli idi. Bunların hamısını faytonçuluqla qazanmışdı.* A.Şaiq.

**FAYTONSÜRƏN** *is.* Faytonçuluqla məşğul olan adam, fayton sürən; faytonçu.

**FÁZA** [*yun.* phasis – zahir olma] 1. Hər hansı bir hadisənin, prosesin və s.-nin inkişafında ayrıca mərhələ, dövr, moment. *İşin son fazası.*

2. *geol.* Süxurların nə xarakterdə olduğunu müəyyən edən kiçik vaxt vahidi.

3. *astr.* bax **səfhə** 2-ci mənada.

4. *elektr.* Generator sarğısının ayrıca qrupu, habelə onu birləşdirən məftil (elektrik keçiricisi). *Fazaların dəyişmə qaydası. Faza göstəricisi.*

**FAZİL** *sif.* [*ər.*] Fəzilət sahibi, fəzilətli. [Saib:] *Bizdə çoxdur, sanırım, fazil adam; Qalmamış gizli həqiqət əsla.* H.Cavid. [Xangili] *bu fazil şəxs üçün əllərindən gələni əsla əsirgəmirdilər.* S.Rəhimov.

**FAZÓMETR** [*yun.* phasis – görünmə və metron – ölçürəm] Dəyişən cərəyan qurğularında güc əmsalını və ya fazalardakı dəyişikliyi, yəni enerjinin fazaları arasındakı fərqi və dövrədəki gərginliyi ölçmək üçün cihaz.

**FE** "*f*" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**FEDERÁL** [*fr.*] bax **federativ** 2-ci mənada.

**FEDERALÍST** [*fr.*] Federalizm tərəfdarı.

**FEDERALÍZM** [*fr.*] 1. Dövlət quruluşunun federativ sistemi; federasiya prinsipinə əsaslanan quruluş.

2. Belə sistem yaratmağa çalışan siyasi cərəyan.

**FEDERÁSİYA** *is.* [*fr.*] 1. İttifaq, birləşmə.

2. Müstəqil dövlətləri özündə birləşdirən dövlət. *Rusiya Federasiyası.*

3. Ayrı-ayrı cəmiyyətlərin, təşkilatların birliyi. *Ümumdünya Həmkarlar İttifaqları Federasiyası. Beynəlxalq Futbol Federasiyası.*

**FEDERATÍV** 1. "Federasiya"dan *sif. Federativ müşavirə.*

2. Federasiya şəklində olan; federal. *Federativ Respublika.*

**FEİL** *is.* [*ər.*] 1. İş, əməl, hərəkət. // Quru sözdən ibarət olmayıb həqiqi mənada olan iş. *Feli ilə qövlü düz gəlmir.*

2. *qram.* İş, hal və hərəkəti bildirib zaman, şəxs və kəmiyyətcə təsriflənən nitq hissəsi.

3. *məc.* Hiylə, kələk, fənd, fırıldaq, haramzadəlik. *Arada işləyir düşmən felləri; Mənim ərəb atım gördünmü ola?* "Koroğlu". *Divlər qüvvətdən çox, ağıldan az olarlar. Qızların felinə uyub dedilər: – Ey nazəninlər, şərtinizə razıyıq.* (Nağıl).

◊ ...**felinə düşmək** – birisinin fırıldağına, hiyləsinə, kələyinə inanaraq, yaxud təsiri altında bir iş görmək. *Fırıldaqçının felinə düşmək. - Mən aşiq, duman yerdə; Dağ yerdə, duman yerdə; Düşmən felinə düşmə; Qalarsan yaman yerdə.* (Bayatı).

**FELDMÁRŞAL** [*alm.*] 1917-ci il inqilabından əvvəlki rus ordusunda və bir sıra dövlətlərin quru qoşunlarında yüksək general rütbəsi; habelə bu rütbəni daşıyan adam.

**FELDMARŞALLIQ** *is.* Feldmarşal rütbəsi.

**FÉLDŞER** [*alm.*] Orta tibb təhsili olan həkim köməkçisi. *Növbətçi feldşer. Baytarlıq feldşeri.* – [Gülqönçə:] *Axı mən o feldşerdən pis deyiləm.* H.Seyidbəyli.

**FELDŞERLİK** *is.* Feldşerin işi, sənəti, peşəsi, ixtisası. *Feldşerlik etmək. Feldşerlik məktəbi.*

**FELƏN** *zərf* [*ər.*] Sözlə deyil, işlə, həqiqətdə (*qövlən* ziddi). *Bacarığını felən sübut etdi.*

**FELİ** *sif.* [*ər.*] 1. Həqiqətən icra olunan, həqiqətən olan, sözlə deyil, işlə olan.

2. *qram.* Tərkibində feil olan, yaxud feildən düzəldilmiş (bax **feil** 2-ci mənada). *Feli cümlə. Feli söz birləşməsi. Feli isim. Feli sifət.*

**FELYETÓN** [*fr.*] Nöqsanları, çirkin əməlləri istehza edib pisləyən qəzet və ya jurnal məqaləsi. *Cəlil Məmmədquluzadənin felyetonları.* "*Kirpi*" *jurnalında çap olunmuş felyeton.*

**FELYETONÇU** *is.* Felyeton yazan jurnalist. *C.Məmmədquluzadə görkəmli felyetonçu idi.*

**FEMÍDA** *is.* [*yun.*] 1. Qədim yunan mifologiyasında ədalət ilahəsi, sonralar ədalət mühakiməsinin mücəssəməsi. *Femida gözübağlı və əlində çəki daşları tutmuş vəziyyətdə təsvir olunurdu.*

2. *məc.* Ədalət.

**FEMİNÍZM** *is.* [*ər.*] Qadın hərəkatı. *Feminizm tərəfdarları.*

**FEN** *is.* [*ing.*] Saç qurutmaq üçün elektrik alət.

**FÉNİKS** *is.* [*yun.*] Bir sıra qədim xalqların mifologiyasında əfsanəvi quş, simurq.

*Guya feniks qocalanda özünü yandırır, küldən cavanlaşmış və təzələnmiş şəkildə dünyaya gəlir. Feniks əbədi dirçəliş rəmzidir.*

2. Səməndər quşu.

**FENOLÓGİYA** [*yun.* phaino və logos] Biologiyanın, ilin fəsillərinin dəyişməsilə əlaqədar bitki və heyvanların həyatında vaxtaşırı baş verən hadisələri (bitkilərin çiçəklənməsini, quşların köçüb gəlmə müddətini və s.-ni) öyrənən bəhsi. *Ekoloji fenologiya.*

**FENOLOJÍ** *sif.* Fenologiyaya aid, fenologiya ilə əlaqədar olan. *Fenoloji müşahidələr. Fenoloji qanunauyğunluqlar.*

**FENÓLOQ** [*yun.* phaino və logos] Fenologiya mütəxəssisi.

**FENÓMEN** *is.* [*yun.*] Müstəsna, qeyri-adi şəxsiyyət, hadisə.

**FEODÁL** [*lat.*] 1. Feodalizm dövründə hakim sinfin nümayəndəsi; təhkimçi mülkədar. *..Havayı gəlir mənbəyi olan kəndlərini itirmək qorxusu ilə titrəyən feodallar dünyanın hər yerində qara qüvvədir.* M.İbrahimov.

2. Feodala, feodalizmə aid olan. *Feodal vergi sistemi.*

3. Feodalizm prinsiplərinə əsaslanan. *Feodal dövləti. Feodal quruluşu.*

4. *sif.* Feodala, feodalizmə xas olan. *Feodal münasibətlər.*

**FEODALÍZM** *is.* [*lat.* feodum – malikanə.] Orta əsrlərdə xüsusilə Qərbi Avropada torpağın, istehsal vasitələri və kəndlilərin tək bir feodalın ixtiyarında olmasına əsaslanan, ümumdünya tarixi tərəqqinin gedişində ictimai-iqtisadi formasiyaların əvəz olunmasından ibarət bütöv dialektik prosesin orta həlqəsini təşkil edən ictimai-iqtisadi formasiya. *Feodalizm dövrünün ideologiyası. Feodalizm zəmanəsi quldarlıq quruluşu ilə kapitalizm arasındakı dövrü əhatə edir.*

**FÉRMA**[1] [*fr.*] 1. Heyvandarlığın müəyyən sahəsi ilə məşğul olan ixtisaslaşdırılmış ayrıca təsərrüfat. *Atçılıq ferması. Quşçuluq ferması. Fermaların yarışı.* – [Gülsənəm arvadın] *qaş qaralanda, fermada sağını qurtarıb evə qayıdan zaman az qala dili tutulmuşdu.* M.Hüseyn

2. Xüsusi və ya icarəyə götürülmüş torpaqda xüsusi təsərrüfat.

**FÉRMA**[2] [*fr.*] *xüs.* Bir-birilə birləşdirilmiş metal tirlərdən, dirəklərdən ibarət mühəndis qurğusu. *Körpünün ferması. Fermanın hissələrini qaynaq etmək.* – [Kamil] *sütunları göstərən qara nöqtələrin üstündə şəbəkə fermalar, sonra taxta döşəmə, buruq binası və başqa hissələr rəsm etdi.* M.Süleymanov.

**FERMAÇI** *is.* Ferma icarəçisi və ya sahibi; fermer (b a x **ferma**[1] 2-ci mənada).

**FERMÉNT** [*lat.* fermentum – maya] *biol. kim.* Canlı hüceyrənin əmələ gətirdiyi və orqanizmdə kimyəvi reaksiyanın sürətlənməsinə kömək edən üzvi maddə. *Ferment reaksiyası. Fermentlər həyat fəaliyyətinin bütün proseslərində mühüm rol oynayır.*

**FERMENTÁSİYA** [*lat.* fermentare – qıcqırtma] *xüs.* Qıcqırma prosesi. *Tütünün fermentasiyası. Çay yarpaqlarının fermentasiyası.*

**FÉRMER** [*ing.*] b a x **fermaçı**.

**FERMERLİK** *is.* Təsərrüfatda ferma sistemi.

**FESTİVÁL** [*fr.* festival – bayram] İncəsənətin hər hansı növünü nümayiş etdirən ictimai bayram. *Musiqi festivalı. Teatr festivalı. Gənclərin ümumdünya festivalı.*

**FETÍŞ** [*fr.*] 1. İbtidai insanların təsəvvüründə guya fövqəltəbii sehrkar qüvvəyə malik olan və buna görə də sitayiş obyektinə çevrilən cansız şey; sənəm, büt. *Fetişlər cürbəcür olur: daş, ağac parçası, təsvirlər.*

2. *məc.* Kor-koranə, sözsüz-şərtsiz inanılan, qəbul edilən şey.

**FETİŞÍZM** [*fr.*] 1. Fetişlərə (bütlərə) sitayiş; qədim din formalarından biri; bütpərəstlik. *Fransız maarifçiləri fetişizmə dinin arxaik forması kimi baxırdılar.*

2. *məc.* Bir şeyə kor-koranə inanma, sitayiş etmə.

◊ **Əmtəə fetişizmi** *iqt.* – istehsal münasibətlərinin maddiləşdirilməsi.

**FETİŞLƏŞDİRMƏ** "Fetişləşdirmək"dən *f.is.*

**FETİŞLƏŞDİRMƏK** *f.* Fetiş hesab etmək, fetiş halına salmaq, fetiş kimi baxmaq (b a x **fetiş** 1-ci mənada); ilahiləşdirmək.

**FETR** [*fr.*] Şlyapa, keçə çəkmə və s. hazırlanan ən zərif və əla keçə növü. // Bu keçədən hazırlanmış. *Fetr şlyapa.*

**FEVRÁL** [*lat.*] Təqvim ilinin ikinci ayı. ☐ **Fevral inqilabı** – Rusiyada: 1917-ci ilin fevralında başlayan ikinci burjua demokratik inqilabı.

**FEYXOÁ** *is.* [*isp.*] *bot.* Mərsin fəsiləsindən kol bitkisi. *Astara rayonunun limon, naringi, feyxoa, xurma bağlarında məhsul toplanır.* (Qəzetlərdən). // Həmin kolun – bitkinin çiyələk, ananas və banan iyi verən meyvəsi. *Feyxoanın meyvəsi açıq-yaşıl və yumurtaşəkillidir.*

**FEYZ** *is.* [*ər.*] Nemət, bərəkət, rifah, bolluq. // İnsanın hər hansı maddi və mənəvi tələbini təmin edən, ona zövq verən, məmnunluq hissi törədən, fayda verən şey. [Məlikşah:] *Səfər et, bax, nə gözəldir dünya; Çox olur feyzi xəyal aləminə.* H.Cavid. *Öz feyzini hər yanda təbiət; Vermiş bizə zəhmətlə, əməklə.* M.Müşfiq. ☐ **Feyz almaq (aparmaq)** – b a x **feyzlənmək**. *Padşah o qədər feyz apardı ki, naxoşluğu tamam sağaldı.* "Məsum". *Dünyaya gəlmişik; Həyatdan, dünyadan feyz alaq; Dünyaya gəlmişik; Dünyada ucalaq.* B.Vahabzadə.

**FEYZLƏNMƏ** "Feyzlənmək"dən *f.is.*

**FEYZLƏNMƏK** *f.* Feyz almaq, zövq almaq, ləzzət aparmaq. *Musiqidən feyzlənmək.*

**FEYZLİ** *sif.* Feyz verən, rifah verən, nemət verən, sevinc gətirən.

**FEYZYAB** [*ər.* feyz və *fars.* ...yab]: **feyzyab etmək** – feyzləndirmək, feyz vermək. *Həmişə şəhərə qayıdanda Cənnətəli şeirləri ilə məni də feyzyab edər.* Çəmənzəminli. [Məşədi Qəzənfər:] .. *Dərvişlər hamısı hamama yığılıb gözəl-gözəl söhbətlərlə hamam əhlini feyzyab edərlərmiş.* Ü.Hacıbəyov. **Feyzyab olmaq** – feyzlənmək, feyz almaq, fayda götürmək (bəzən kinayə ilə deyilir). *..İranlı qardaşlarımız Məhəmməd Əli Tehrani cənablarının moizəsini eşitməkdən feyzyab oldular.* C.Məmmədquluzadə. *Onuncu günü şəbihi şəhərin ətrafında, böyük bir kəndin yaxınlığında çıxarmağa başladıq ki, kənd əhalisi də feyzyab olsun.* Ə.Haqverdiyev.

**FƏAL** [*ər.*] 1. *sif.* İşlək, çalışqan, işcil, fəaliyyətli, daim fəaliyyət göstərən, çox iş görən, çox işləyən. *Çox fəal adamdır.* – [Malik] *Sona kimi bir neçə fəal gəncləri içəri apardı.* M.İbrahimov. // *zərf* Fəaliyyətlə, fəal surətdə, aktiv surətdə. *İclasda fəal iştirak etmək.*

2. *is.* Hər hansı bir kollektivin və s.-nin ən çalışqan, işcil, fəaliyyətli üzvü (çox vaxt cəm şəklində işlənir); aktivist. *Partiya fəalları yığıncağı.* – [Həsrət Yusifə:] *Əyə, bəs bu kəndin fəalları hanı, partiya təşkilatı nə iş görür?* B.Bayramov.

**FƏALİYYƏT** *is.* [*ər.*] 1. Hər hansı bir sahədə iş, çalışma; fəallıq göstərmə; aktivlik. *Pedaqoji fəaliyyət. İctimai fəaliyyət.* – [Firidun] *yalnız fəaliyyətdə, yalnız çalışmaqda bir təskinlik taparaq bütün varlığını yenidən dərslərə və işə vermişdi.* M.İbrahimov.

2. İş, işləmə. *Suyun dağıdıcı fəaliyyəti. Ürəyin fəaliyyəti. – Zehni əmək zamanı hərdənbir gəzinmə beynin fəaliyyətini artırır, yorğunluğun qarşısını alır.*

**FƏALİYYƏTLİ** *sif.* Çalışqan, işcil, fəaliyyət göstərən; aktiv. *Mən* [Fəxrəddin], *özlərini dəyərli və fəaliyyətli idarəçi və çalışqan göstərə bilmiş Eldəniz xanədanından bir nəfərin hökmdarlığa təyin olunmasını təklif edirəm.* M.S.Ordubadi.

**FƏALİYYƏTSİZ** *sif.* Fəaliyyət göstərməyən, çalışmayan, işləməyən; hərəkətsiz, passiv. *Fəaliyyətsiz* (z.) *durmaq* (heç bir iş görməmək).

**FƏALİYYƏTSİZLİK** *is.* Fəaliyyət göstərməmə, işləməmə, çalışmama, hərəkətsizlik, passivlik. [Fəxrəddin:] *İlyas, sən elə bilmə ki, mən səni fəaliyyətsizlikdə, üsyan və azadlıq tərəfdarı olmamaqda töhmətləndirmək istədim.* M.S.Ordubadi.

**FƏALLAŞDIRMA** "Fəallaşdırmaq"dan *f.is.*

**FƏALLAŞDIRMAQ** *f.* Fəal etmək, fəaliyyətini daha da artırmaq, daha da canlandırmaq; aktivləşdirmək. *İctimai iş şagirdləri fəallaşdırır. Müəllim yeni mövzunu yaxşı mənimsəmək və sinfi fəallaşdırmaq məqsədilə canlı müsahibə apardı.*

**FƏALLAŞMA** "Fəallaşmaq"dan *f.is.*

**FƏALLAŞMAQ** *f.* Daha fəal olmaq, fəaliyyətini daha da artırmaq; aktivləşmək.

**FƏALLIQ** *is.* İşcillik, çalışqanlıq, fəaliyyət, aktivlik. *Fəallıq göstərmək.*

**FƏCİ** [*ər.*] b a x **faciəli**. *Fəci hadisə. – Bu fəci xəbəri hər kəs həyəcan içində bir-birinə pıçıldadı.* Çəmənzəminli. *Şeyx Məhəmmədi fəci bir surətdə öldürüb, cənazəsini nalayiq və narəva hərəkətlərlə təhqir etdilər.* M.İbrahimov.

**FƏCR** *is.* [*ər.*] 1. Səhərin çox erkən, günəş çıxmazdan əvvəlki çağı, dan vaxtı. *Fəcrin saf havası dolur içəri; Kəndi seyr eləyir... Oyanır həyat.* B.Vahabzadə. *Fəcrin qızıl rənglərilə boyananda mavi göylər; Dünyanın hər tərəfindən anaların səsi gəlir.* N.Rəfibəyli.

2. Dan vaxtı göydə görünən qızartı və aydınlıq. *O baxışlarda fəcrdən parlaq; Bir ziya var buluddan daha saf.* A.Şaiq.

**FƏDA** *is.* [*ər.*] Ən əziz bir adam və ya yüksək amal, iş yolunda özünü qurban etmə; qurban. *Pəri sənə qurban, dirili Qurban; Yolunda fədadı bu baş ilə can.* "Qurbani". ☐ **Fəda etmək** – canını qurban etmək. [Mirzə Rza:] *Qardaşlar, bütün İran məzlumlarını və onların arasında öz balalarımı xilas etmək üçün mən də həyatımı fəda edirəm.* C.Cabbarlı. **Fəda olmaq** – özünü fəda etmək, canını qoymaq, qurban etmək, həlak olmaq. *Qıldın bu vəfalığı mənimlən; Can ola fəda sənə tənimlən.* Xətayi. **Fəda olum** – qurban olum (nəvaziş, mehribanlıq, yalvarış bildirir). [Oğul:] *Ata, sənə fəda olum, mənə görə qulluq.* (Nağıl). *Fəda olum sənə, gəl eylə imtahan, ölürəm.* Natəvan. **Fəda qılmaq** *klas.* – b a x **fəda etmək**. *Qurban bu mehribanlığa, ey Kəbeyi-ümmid; Bundan sonra çevir başına, qıl fəda məni.* S.Ə.Şirvani.

**FƏDAİ** *is.* [*ər.*] Ümumi bir iş yolunda, məslək uğrunda təhlükəli işlərə qoşulub canından keçməyə hazır olan şəxs. *İnqilab fədailəri. Fədai dəstəsi. – Bir il qabaq bir faciə eşitmişəm, ah! Bir qəhrəman fədaidən söhbət açım mən.* S.Vurğun. [Pərvin Ədalətə:] *Yadındadırmı, hələ keçən ilin qışında bu meydanda fədailərimizin tonqalları yanırdı..* Ə.Məmmədxanlı. // Sif. mənasında. *Hər tərəfdə fədai və nizami qoşun nəfərləri intizamı qoruyurdu.* M.İbrahimov. [Uşaqlar] *tüfəngli fədai dəstələrinin nümayişini görürkən əvvəlcə bu nümayişləri də Təbrizdə bundan əvvəl olan sadə nümayişlərdən biri hesab edirdilər.* Ə.Sadıq. // Məc. mənada. *Ədəbiyyat fədaisi.*

**FƏDAKAR** *sif.* [*ər.* fəda və *fars.* ...kar] 1. Ümumi bir iş və ya məslək uğrunda öz şəxsi mənafeyindən keçən, özünü qurban verməkdən çəkinməyən. *Fədakar gənclər. Fədakar əsgər. – Vətən uğrunda gərək şəxs fədakar olsun.* A.Səhhət. // Öz məqsədini həyata keçirmək yolunda çalışan, hər cür fədakarlığa hazır olan. *Fədakar övlad. –* [Bəxtiyar:] *Fədakar bir qızsan, əhsən. Ancaq zəhmətlərin boşdur.* A.Şaiq.

2. Fədakarlıq ifadə edən; fədakarcasına. *Adamlarımızın fədakar zəhməti. Fədakar hərəkət. – Biz döyüşçülərə xalqın həyatından, neftçilərimizin fədakar əməyindən danışırıq.* M.İbrahimov.

**FƏDAKARANƏ** [*ər.* fəda və *fars.* karanə] b a x **fədakarcasına**. *Bəzən Sarının çox fədakaranə çalışmağı və süfrə salması* [Dəmirovu] *təmin etmirdi..* S.Rəhimov.

**FƏDAKARCASINA** *zərf* Özünü fəda edərək; fədakarlıqla, fədakarlıq göstərərək. *Fədakarcasına işləmək.*

**FƏDAKARLIQ** 1. *is.* Öz şəxsi mənafeyini ümumi işə və ya başqalarının işinə fəda etmə, həsr etmə, bu uğurda fədakarcasına çalışma, səy göstərmə. [Şiraslan da] *atası kimi Vətən qarşısında bir iş görmək, öz fədakarlığı ilə adamlara xidmət etmək istəyirdi.* S.Rəhimov.

2. **Fədakarlıqla** şəklində *zərf* – b a x **fədakarcasına**. *Müəllim heyəti fədakarlıqla çalışırdı.* S.Rəhimov.

**FƏĞAN** *is.* [*fars.*] Nalə, fəryad, inləmə. [Abbas:] *Gecə-gündüz qan ağlaram; Artıbdı fəğanım mənim!* "Abbas və Gülgəz". ☐ **Fəğan etmək** – fəryad qoparmaq, nalə etmək, inləmək, ağlamaq, göz yaşı tökmək. *Gecə-gündüz ahü fəğan etməkdən; Dərdə, qəmxanəyə yol almışam mən.* Aşıq Ələsgər. // Nalə, fəryad, ah. *Səni görmək üçün ölmək istərəm; Təsəllim ah ilə fəğandır, ana!* S.Vurğun. *Bir yaz günü oxudum şerini, böyük ustad; Duydum, nakam ürəkdən qopan acı fəğandır.* R.Rza.

**FƏHLƏ** *is.* [*ər.*] İstehsalatda bir peşə kimi əməklə məşğul olan, işçi sinfinə mənsub əməkçi; əmələ. *Fəhlə və kəndli təbəqəsi.* // Öz iş qüvvəsini satmaqla yaşamağa məcbur olan muzdlu işçi; proletar. *Fələ, özünü sən də bir insanmı sanırsan?!* M.Ə.Sabir. *Fəhlələrin bir həftə əvvəl başlamış tətili hələ də davam edirdi.* M.Hüseyn.

**FƏHLƏBAŞI** *is.* Baş fəhlə, fəhlələrin başçısı.

**FƏHLƏLİK** *is.* Fəhlənin işi, peşəsi; əmələlik. *Fəhləlik etmək. Yazıçı ədəbiyyata fəhləlikdən gəlmişdir. – Aslan da hər gün öz fəhləliyində olub Fərhadın işindən xəbəri yox idi.* C.Cabbarlı.

**FƏHM** *is.* [*ər.*] Anlama, anlaq, dərrakə. *Olmasın fəhmin, əqlin, idrakın; Var nə qəm ta ki vardır əmlakın.* M.Ə.Sabir. □ **Fəhm etmək** – anlamaq, başa düşmək, dərk etmək. *Ariflər, fəhm eləyin; Süzüb gedən yarə baxın!* Aşıq Ələsgər. *Rəğbət və narazılıqla yoğrulmuş bu dumanlı soyuqluğun incəliyini hamıdan çox Əlikram fəhm eləmiş olardı.* B.Bayramov. **Fəhm qılmaq** *klas.* – b a x **fəhm etmək**. *Sözlər dersən ki, bilməzəm mən; Məzmununu fəhm qılmazam mən.* Füzuli.

**FƏHMLİ** *sif.* Anlaqlı, idraklı, dərrakəli. *Fəhmli adam.* – [Ərknaz:] *Ramiz çox qeyrətli, fərasətli uşaqdır. Çox qanacaqlı, mərifətli, fəhmli, qabiliyyətli uşaqdır.* Mir Cəlal.

**FƏHMSİZ** *sif.* Anlaqsız, idraksız. *Fəhmsiz oğlan.*

**FƏXR** [*ər.*] 1. *is.* İftixar ediləcək, öyünüləcək şəxs, şey. *Övlad atanın fəxridir. Doğma Vətənin fəxri.* – [1-ci cəngavər:] *Səyavuş bu yurdun fəxri, şanıdır.* H.Cavid. *Kazımın .. üzündə bir fəxr duyğusu ifadə olunurdu.* Çəmənzəminli. □ **Fəxr etmək** – iftixar etmək, öyünmək. *Dünyaya səs salan şöhrətimizlə; Sevindik, fəxr etdik, lovğalanmadıq.* S.Rüstəm. [Qafar] *öz vətəni, öz paytaxtı, öz xalqı .. ilə fəxr edir...* Ə.Sadıq.

2. **Fəxrlə** şəklində *zərf* – iftixarla, fəxr edərək. *Fəxrlə cavab vermək. Fəxrlə irəli çıxmaq.*

**FƏXRİ** *sif.* [*ər.*] 1. Hər hansı xidmətə, nailiyyətə görə ehtiram, iftixar əlaməti olaraq verilən. *Fəxri adlar. – Adilin fəxri fərmanı ilə yanaşı Gözəlin aldığı fərman da görünürdü.* Ə.Vəliyev. // Hörmət, ehtiram əlaməti olaraq seçilən. *Fəxri rəyasət heyəti. Fəxri üzv.* // Hörmətli, şərəfli, əziz, izzətli. *Fəxri qonaq.* // Hörmət, ehtiram əlaməti olaraq edilən hörmət, ehtiram üçün düzəldilən. *Fəxri qəbul. Fəxri qarovul.*

2. Hörmətli, şərəfli, şərəf qazandıran, şərəfləndirən. *Fəxri vəzifə. Fəxri əmək.*

**FƏXRİYYƏ** *is.* [*ər.*] *ədəb.* Orta əsrlərdə Şərq (o cümlədən Azərbaycan) ədəbiyyatında: məsnəvi, qəzəl və s. formalarda şairin öz fəzilətlərindən, yaxşı sifətlərindən, xüsusən hünər və səxavətindən mədh şəklində bəhs edən lirik şeir. *Füzulinin* “*Mənəm ki qafiləsalari-karivani-qəməm*” *fəxriyyəsi.*

**FƏQƏRƏ** *is.* [*ər.*] 1. *anat.* Fəqərə sütununun bir hissəsini təşkil edən ayrıca sümük (və ya bəzi heyvanlarda qığırdaq); onurğa sümüyü. *İnsanın döş fəqərəsi. Qısa sümüklər onurğada olur və fəqərələr adlanır.* □ **Fəqərə sümüyü (sütunu)** – insanın və bir çox heyvanların skeletinin, bir-biri ilə mütəhərrik surətdə birləşmiş sümüklərdən və qığırdaqlardan (fəqərələrdən) əmələ gələn əsas hissəsi.

2. Hadisə, əhvalat, qəziyyə, vaqiə, hekayə. [Xortdan:] *Mən oxucularıma özüm şahid olduğum bir fəqərədən danışım.* Ə.Haqverdiyev. *Gülsabah gələndən bir neçə gün qabaq Muradla Göyçək arasında belə bir fəqərə olmuşdu.* Ə.Vəliyev.

3. *köhn.* Bənd, maddə (elmi və s. əsərlərdə).

**FƏQƏT** *bağl.* [*ər.*] Lakin, amma. *Söz verdi, fəqət gəlmədi. Xəbəri var, fəqət demək istəmir.* – [Zaqs müdiri:] *Adam evdə, – dedi, – əsəbiləşə bilər, bəlkə dalaşar da, fəqət dörd-beş illik bir ailə həyatını pozmaz.* S.Hüseyn. *Gənclərin sevdiyi gözəl bahardır; Fəqət hər mövsümün bir dadı vardır.* M.Müşfiq. // Ancaq, yalnız.

**FƏQİR** [*ər.*] *klas.* b a x **fağır**. [Kərbəlayı Məhəmməd:] *Hər nə oldu, biz kasıba, biz fəqirlərə oldu.* Çəmənzəminli. [Şahidlər] *Xeyransanın təmiz və fəqir bir qadın olduğunu söylədilər.* S.Hüseyn.

**FƏQİRANƏ** [*ər.* fəqir və *fars.* ...anə] 1. *zərf klas.* Fağır kimi, yazıqcasına, acizcəsinə, yazıq-yazıq, fağır-fağır. *Fəqiranə baxmaq. Fəqiranə yalvarmaq.*

2. *sif.* Kasıb, yoxsul, miskin. *Fəqiranə bir mənzil. Fəqiranə həyat. – Baxmasız guşeyi-çeşm ilə fəqiranə tərəf; Yüyürürsüz ora kim, dadlı fisincanlıq olur.* M.Ə.Sabir. *Züleyxa, Aslanı fəqiranə, miskin və məhzun görüb, tez Fərhadın deyil, əvvəlcə Aslanın boynunu qucaqlayaraq ağladı.* C.Cabbarlı.

**FƏQİRLİK** *klas.* bax **fağırlıq**. *Yetimliyi halətindən bəllidir; Fəqirliyi zillətindən bəllidir.* A.Səhhət. *O zaman fəqirlik* [Ağabalaya] *əsər edib başı xəyalat ilə dolardı.* Çəmənzəminli.

**FƏLAKƏT** *is.* [*ər.*] Böyük bəla, müsibət, afət, bədbəxtlik. *Müharibənin törətdiyi fəlakətlər.* – [Nüşabə:] *Bir qığılcım böyüyüb yanğın olar; Bir xəta qanlı fəlakət doğurar.* A.Şaiq. [Qəmər Gülsabaha:] *Sən mənim fəlakətimə gülürsən?* C.Cabbarlı. // Avariya, qəza, bədbəxt hadisə. *Təbii fəlakət. – Kamilgilin gəmisi* "*Şəfəq*" *Şeytanşəhərdə fəlakətə düşübdür.* M.Süleymanov.

**FƏLAKƏTLİ** *sif.* Fəlakət törədən, bədbəxtliyə səbəb olan, müsibət gətirən. *Fəlakətli müharibə illəri. Fəlakətli daşqın.* – [5-ci tamaşaçı:] *Ən fəlakətli böyük yanğınlar; Bir qığılcımlı xətadan başlar.* H.Cavid. *Deyirlər ki, fəlakətli və ağır günlərdə xatırlanan keçmiş səadət dəqiqələri insan üçün çox əziz və dadlı olur.* M.İbrahimov.

**FƏLAKƏTZƏDƏ** *sif.* və *is.* [*ər.* fəlakət və *fars.* ...zədə] Fəlakətə düçar olmuş, qəzaya uğramış; müsibətzədə, bədbəxt. *Kiçik daxmada üç nəfər fəlakətzədə xəyalat içində huşa gedib bir-birinə sarılmışdı.* C.Cabbarlı. *Həmin fəlakətzədə Məşədi Əsgər qırx yaşında, qısaboylu, amma çox zorlu bir kişi idi.* S.M.Qənizadə.

**FƏLƏK** *is.* [*ər.*] 1. Göy, səma, asiman. *Dün gecə fələkə çıxdı fəryadım.* M.P.Vaqif. *Hərlənib dövr edən yerlər, fələklər; Bu səsi hər zaman eşidəcəklər.* M.Rahim.

2. *məc.* Tale, qismət, bəxt, uğur. *Fələk ayırdı məni cövr ilə cananımdan.* Füzuli. [Vəzir:] *Sən mənim qızım ol, sarayımda qal; Görək neylər fələk, şənlən, oxu, çal!* A.Şaiq.

◊ **Fələk göydən yerə ensə də** – qətiyyən, heç bir vəchlə, qəti surətdə, əsla. *Fələk göydən yerə ensə də, deyən deyiləm.* **Fələk üz döndərmək** – işi bəd gətirmək, uğursuzluğa düçar olmaq, bəxti dönmək, bəxti gətirməmək. [Kərəm:] *Qurtarmadım heç qovğadan, bəladan; Fələk üz döndərib mən mübtəladan.* "Əsli və Kərəm". **Fələk yazan** – tale, qismət, müqəddərat, alın yazısı. [Qurbanqulu:] *Fələk yazanı biz pozmayacağıq ki, qismət belə imiş!* T.Ş.Simurq. **Fələkin çərxi dönmək** – tale üz döndərmək, taleyin üzü dönmək, ümidi boşa çıxmaq. **Fələkin çərxi dönsün** – qarğış məqamında işlədilir. **Fələkin qəminə (güdazına) getmək** – öz taleyinin qurbanı olmaq. **Fələkin qəminə (güdazına) vermək** – bədbəxt etmək. [Süleyman:] *Göz görə-görə* [Tofiq] *səni verir fələkin qəminə, sən də başlamısan moizəyə.* M.İbrahimov.

**FƏLSƏFƏ** *is.* [*ər.*; *yun.* phileo – sevirəm və sophio – müdriklik, müdrikliyi sevmək] 1. Təbiətin, cəmiyyətin və insan təfəkkürünün ən ümumi inkişaf qanunları haqqında elm. *Antik fəlsəfə. Fəlsəfə tarixi. Orta əsrlər Azərbaycan fəlsəfəsi.*

2. Hər hansı bir filosofun, mütəfəkkirin fəlsəfi nəzəriyyəsi, görüşü. *Platonun fəlsəfəsi. Bəhmənyarın fəlsəfəsi. – Nəsimi öz fəlsəfəsi və təfəkkürü ilə əlaqədar olaraq, dilimizin çərçivəsini xeyli genişləndirdi.* M.İbrahimov. // *dan.* Bir şey haqqında əmələ gəlmiş inam, əqidə, qənaət; konsepsiya. [Rüstəm bəy Sofya xanıma] *nəsihət eləmək istədi, bir də xanımın gözəlliyi onun fəlsəfəsinə qələbə çaldı..* Çəmənzəminli. [Sultan Səmədə:] *Sən fəlsəfənin məğzini bilmirsən. Dünya mübarizə dünyasıdır.* İ.Hüseynov.

3. Hər hansı bir elmin, bilik sahəsinin və s.-nin əsasını təşkil edən metodoloji prinsiplər. *Hüquq fəlsəfəsi. Riyaziyyatın fəlsəfəsi.*

4. *dan.* Həyata keçirilə bilməyən, qeyri-real, lüzumsuz söhbət(lər); mühakimə.

**FƏLSƏFİ** *sif.* [*yun.*] 1. Fəlsəfəyə aid olan, fəlsəfə ilə əlaqədar olan (bax **fəlsəfə** 1-ci mənada). *Fəlsəfi traktat. Fəlsəfi kateqoriyalar. Fəlsəfi fikir.*

2. *kit.* Dərin bir ideyanı, dünyagörüşünü, konsepsiyanı ifadə edən; hikmətamiz, hikmətli. *Fəlsəfi dram. Fəlsəfi roman. – Yüksək, pak və təmiz bir eşq ifadə edən Füzulinin dahiyanə fəlsəfi sənət əsərlərində bəzən bir kədər, acı bir faciə duyulur.* M.İbrahimov.

3. *məc.* Nəzəri, mücərrəd, hikmətli. *Fəlsəfi mühakimə.*

4. *dan.* Bir şeyə filosof kimi, ağılla yanaşan. *Hadisəyə fəlsəfi münasibət.*

**FƏNA**[1] *is.* [*ər.*] Pis, yaman. *Əhvalı fənadır. Fəna xasiyyət. – Gördü fənadır işinin axırı; Qaçdı o saat ayı ordan geri.* A.Səhhət. [Məcid] *Səmədin fəna hərəkətlərindən bir neçəsini göstərib, bunun qarşısını almağı təklif edirdi.* B.Talıblı.

**FƏNA**[2] *is.* [*ər.*] Yox olma, zaval. ☐ **Fəna etmək, fənaya vermək** – yox etmək, məhv etmək, bada vermək. [Şəfiqə:] *Bunlar, qorxuram, axırda bizi fənaya verə.* İ.Musabəyov. *Çoxdur ümid hələ çıxmamış cana; Cavan ömrünüzü etməyin fəna.* H.K.Sanılı.

**FƏNALAŞMA** "Fənalaşmaq"dan *f.is.*

**FƏNALAŞMAQ** *f.* Pisləşmək, xarablaşmaq. *Getdikcə bu məhəllənin halı fənalaşdı.* N.Nərimanov. [Zəhra Əzraya:] *Bax, fənalaşdı büsbütün halım.* H.Cavid.

**FƏNALIQ** *is.* Pislik, yamanlıq. [Cahangir:] *Ana, bu adamlardan hər bir fənalıq baş verər, məni öldürə bilərlər, sənin namusuna sataşarlar.* Çəmənzəminli. [Şahin] *səbəbsiz təhqir olunduğu üçün iztirab çəkir, səhhətində də bir fənalıq hiss edirdi.* B.Bayramov.

**FƏND** *is.* [*fars.*] 1. Hiylə, kələk, fırıldaq, dolab, qurğu, biclik. *Fənd fəndi kəsər, Allah hər ikisini.* (Ata. sözü). *Dostdan dosta bu nə fənddi? Zülfün boynuma kəmənddi.* Aşıq Ələsgər. *Əllafın fəndinə adamlar mat qaldılar.* Mir Cəlal. ☐ **Fənd bağlamaq** – hiylə gəlmək, kələk gəlmək, aldatmaq. [Yusif:] *İnandırıram sizi ki hərgah bir də fənd bağlaya, çox işlər görər.* N.Nərimanov. **Fənd işlətmək** – 1) fırıldaq qurmaq, hiylə işlətmək, kələk gəlmək, fənd qurmaq; 2) *məc.* bir işi görmək üçün müxtəlif üsullardan istifadə etmək. *Fəhlələrin daha düzgün fənd işlətdiklərini görən yanğın alayı da onlara qoşuldu.* M.Hüseyn. [Qönçə Ataşa:] *Nə eləyəcəksən, nə cür fənd işlədəcəksən özün bil, ancaq məni buradan qurtar.* Ə.Vəliyev. **Fənd qurmaq** – birisinə qarşı gizlindən tələ qurmaq, hiylə düzəltmək, biclik işlətmək. [Hacı Qəmbər:] *Qoçum Cəbi, görüm nə təhər fənd quracaqsan.* N.Vəzirov. **Fənd tərpənmək** – hiyləyə qarşı hiylə işlətmək, zirək tərpənmək, usta hərəkət etmək. [Sirat:] *Amma Abdulla oğlu Bülənd fənd tərpəndi.* Ə.Əbülhəsən. **Fəndə salmaq** – hiylə işlədərək aldatmaq, tora salmaq.

2. İdman yarışlarında rəqibi aldatmaq üçün tətbiq edilən üsullar; kombinasiya. *Futbolçunun işlətdiyi fəndlər. Rəqibin fəndini başa düşmək.*

**FƏNDBAZ** *is.* və *sif.* [*fars.*] Hiyləbaz, fırıldaqçı, fəndgir, fəndcil. [Əhməd:] *Zalım oğlu nə fəndbazmış, a gədə!* N.Vəzirov.

**FƏNDBAZLIQ** *is.* Hiyləbazlıq, fırıldaqçılıq, fəndgirlik. *Fəndbazlıq etmək.*

**FƏNDCİL** bax **fəndbaz**. *Fəndcil adam.*

**FƏNDCİLLİK** bax **fəndbazlıq**.

**FƏNDGİR** [*fars.*] bax **fəndbaz**. *Fəndgir adam.*

**FƏNDGİRLİK** bax **fəndbazlıq**.

**FƏNƏR** *is.* [*yun.*] 1. Ətrafı və ya bir qismi şüşə, yaxud başqa şəffaf materialla örtülü işıq cihazı; fanus. *Küçə fənəri. Fənərə neft tökmək. Fənəri yandırmaq. – Məhərrəm əlindəki fənəri yerə qoyub təkrar etdi..* H.Nəzərli. *Quru ot üstündə Hüseyn uzanır; Fənərin içində para şam yanır.* M.Rahim. // Elektrik lampası. *Geniş meydanlarda yansın fənərlər; Gecələr kəndimiz çilçıraq olsun.* O.Sarıvəlli. // bax **fara**. *Minik maşınının fənəri. – Hər iki maşının güclü fənərləri geniş bir sahəni işıqlandırırdı.* Ə.Sadıq.

2. *dan. zar.* Zərbədən, zədələnməkdən üzdə əmələ gələn qançır, göy. *Gözünün altında fənər var.*

**FƏNƏRÇİ** *is. köhn.* 1. Küçə fənərlərinin sazlığına və yanmasına nəzarət edən adam; fənəryandıran. *Qalmışdı həyətdə keçən axşamdan; Fənərçi unutmuş bala nərdivan.* H.K.Sanılı.

2. Keçmişdə: gecə yolu işıqlandırmaq üçün böyük adamların yanınca fənər aparan adam. // Əlində fənər gəzdirən adam.

**FƏNƏRYANDIRAN** *köhn.* bax **fənərçi** 1-ci mənada.

**FƏNN** *is.* [*ər.*] 1. Elm, bilik sahəsi, tədris obyekti. *Riyaziyyat fənni. Zoologiya fənni kabineti. –* [Teymur müəllim] *yalnız sinifdə deyil, kənarda da öz sevimli fənni coğrafiyadan saatlarla danışmağı sevərdi.* Ə.Sadıq.

2. b a x **fənd** 1-ci mənada. *Yaman gündə tamam durub kənara; İstər bir fənn ilə özün qurtara.* Q.Zakir. *Hər fənn ediriksə, işimiz tutmayır əsla; Ax!.. Ax!.. O keçən günlərimiz noldu, xudaya.* M.Ə.Sabir.

3. Elm, texnika, bilik. *Bəlkə bir vaxt elm və fənn bərəkətindən bu işlər düzələ.* C.Məmmədquluzadə. *Elmi, fənni, sənəti; Hər yana kitab yayır.* M.Seyidzadə.

**FƏRAQ** *is.* [*ər.*] Ayrılıq, hicran, firqət. *Sevgililərin fəraqı. – Ələsgəri gözdən salma iraqa; Könül tab gətirmir dərdə, fəraqa.* Aşıq Ələsgər. [Rüstəm Səriyyəyə:] *Gözəl mələkim! Mən də fəraqında məcnunam.* C.Cabbarlı. *Fəraqı, firqəti çəkən dağ mənəm; Məndən qeyri dərdli tanıma, bülbül!* Aşıq Şəmşir.

**FƏRAMUŞ** *is.* [*fars.*] *klas.* Unutma, yaddan çıxarma. ☐ **Fəramuş etmək (qılmaq)** – unutmaq, yaddan çıxarmaq. *Bir mey mənə sun ki, məstü mədhuş; Daim özümü qılam fəramuş.* Füzuli. [Lələ:] *Kərəm qıl, sultanım, etmə fəramuş; Müntəzirdi, məlumata gəlmişəm.* "Lətif şah". **Fəramuş olmaq** – unudulmaq, yaddan çıxarılmaq (çıxmaq). *Səni sevən çox bəlayə tuş olur; Ağıl gedir başdan, fəramuş olur.* M.P.Vaqif. *Düşməyir əsla birinin yadına! Oldu fəramuş bu bizim köhnələr!* Ə.Nəzmi.

**FƏRAR** *is.* [*ər.*] Gizlicə qaçma. ☐ **Fərar etmək** – icazəsiz və gizlicə qaçmaq. *O vaxtdan Seyid Cəmaləddin İstanbula fərar etdi.* C.Cabbarlı.

**FƏRARİ** *is.* [*ər.*] Hərbi xidmətdən boyun qaçırmaq məqsədilə hərbi hissədən özbaşına gedən, fərar edən əsgər. [Nazir Ağagülə:] *Bundan sonra fərariləri gizlədən bütün dağ kəndləri topa tutulacaq.* Ə.Məmmədxanlı. // Sif. mənasında. *Fərari əsgər.* // *məc.* Öz vətəndaşlıq borcunu, xidməti və ya ictimai vəzifələrini yerinə yetirməkdən boyun qaçıran adam. [Fikrət:] *Mən hələ fərarilərin ucbatından nə qədər əziyyət çəkdiyimizi demirəm.* M.Hüseyn.

**FƏRARİLİK** *is.* Əsgərlikdən qaçma və ya boyun qaçırma. [Ağagül nazirə:] *İş tərsinə döndü, cənab nazir, yoldaşları qiy am qaldırıb Mustafanı qaçırtdılar və o gündən hissələrdə kütləvi fərarilik başlandı.* Ə.Məmmədxanlı.

**FƏRASƏT** *is.* [*ər.*] Dərhal anlama, başa düşmə, dərk etmə, qavrama bacarığı, zehin itiliyi; ayıqlıq. *..Bu qədər uşaq içində hər kəs Qəhrəmanın zehnindən, fərasətindən, dərsindən danışırdı.* S.Rəhimov. *Qızlar fərasətinə bələd olduqları Şamamaya dərhal hay verdilər.* Ə.Əbülhəsən. // Ağıl, dərrakə. *Övladə çatar həman cəhalət; Nə əql olur onda, nə fərasət.* M.Ə.Sabir. *Hünərlə fərasət bir olan yerdə; Açılır taybatay bağlı qapılar.* O.Sarıvəlli.

**FƏRASƏTLİ** *sif.* Dərhal anlayan, başa düşən, dərk edən, qavrayan; itizehinli, dərrakəli, ayıq. *Fərasətli uşaq.* – [Komandir:] *Bilirsinizmi, komandir yaxşı əsgəri ana fərasətli balasını sevdiyindən daha çox sevir.* M.İbrahimov. [Mirzə Cəmil:] *Böyük bir törəmənin içində vur-tut fərasətlisi ortancıl əmimin madar oğlu idi ki, fələk bildir əlimdən aldı.* Ə.Vəliyev.

**FƏRASƏTSİZ** *sif.* Fərasəti olmayan, dərrakəsiz, bacarıqsız, zehni küt. *Fərasətsiz adam.*

**FƏRD** *is.* [*ər.*] 1. Ayrıca adam, şəxsiyyət. *Qəm yemə, xəstə Vidadi, görüb ədanı kəsir; Haqqa ixlas ilə meydanə girən fərd olmaz.* M.V.Vidadi.

2. Müstəqil halda mövcud olan orqanizm; varlıq. *Saf* (*təmiz*) *halda çoxaltma üsulunda cütləşdirilən fərdlər* (*inək, yaxud camış və törədici dölçülər*) *eyni cinsdən olurlar.*

3. *klas.* Yalqız, tək. *Derdim ki, bəla yolunda fərdəm; Eşq içrə sənə şəriki-dərdəm.* Füzuli. *Ey tifli-sadə, gəzmə soqaqlarda böylə fərd; Alicənab əmulərini bilmə çox da mərd.* M.Ə.Sabir. ☐ **Fərd qalmaq** *klas.* – yalqız olmaq, tək qalmaq. *Qəm mərhələsində qalmışam fərd; Nə yar, nə həmnişin, nə həmdərd.* Füzuli. *Dağıldı yarü ənsarım başımdan, fərd qaldım mən.* S.Ə.Şirvani. // *klas.* Tayıbərabəri olmayan; tək. *Əgər pəhləvanlıqda sən fərdsən; Həqiqət söylə gər cəvanmərdsən?* M.Ə.Sabir.

4. Klassik Şərq (o cümlədən Azərbaycan) ədəbiyyatında bir beytdən ibarət şeir forması. [Mirzə Bəylər:] *Aşiqəm mən sənin ixtilatına; Nəzminə, fərdinə, xoş əbyatına.* Aşıq Ələsgər. *Qatar yola düşdü və mən də məbhut gözdən itənədək dalınca baxdım və*

*bu böhtün içində Sədi mərhumun bir fərdi yadıma düşdü.* Ə.Haqverdiyev.

**FƏRDİ** *sif.* [*ər.*] 1. Yalnız bir fərdə (şəxsə) xas olub onu başqalarından fərqləndirən; şəxsi. *Fərdi üslub.*

2. Xüsusi istifadədə olan; ümumi olmayan; şəxsi. *Fərdi avtomaşın. Fərdi təsərrüfat. Fərdi həyətyanı sahə.*

3. Kollektiv tərəfindən deyil, ayrı-ayrı şəxslər tərəfindən həyata keçirilən. *Fərdi inşaat. Fərdi mənzil inşaatı.*

4. Ayrılıqda hər bir adama aid olan; xüsusi. *Fərdi plan. Fərdi öhdəlik.*

**FƏRDİLƏŞDİRMƏ** "Fərdiləşdirmək"dən *f.is.*

**FƏRDİLƏŞDİRMƏK** *f.* Səciyyəvi fərdi əlamətlərinə görə fərqləndirmək. *Surətlərin dilini fərdiləşdirmək.* // Ayrı-ayrı adamlar, şeylər üçün xüsusiləşdirmək. *Şagirdlərlə məşğələni fərdiləşdirmək.*

**FƏRDİYYƏT** *is.* [*ər.*] 1. Bir şəxs və ya hadisəni başqalarından ayıran səciyyəvi və tipik xüsusiyyətlərin məcmusu. // Təklik.

2. Fərdi, özünə xas əlamət və xüsusiyyətləri olan şəxs; şəxsiyyət, fərd.

**FƏRDİYYƏTÇİ** *sif.* Öz fikir tərzinə və hərəkətlərində fərdiyyətçiliyə meyil edən (adam). // Öz şəxsi mənafeyini cəmiyyətin, kollektivin mənafeyindən üstün tutan, birinci növbədə öz mənafeyini güdən (adam). *Cabbarlı* "*Almaz*" *pyesində əsasən köhnə fərdiyyətçi kəndin mənzərəsini yaratmışdır.* M.Arif.

**FƏRDİYYƏTÇİLİK** *is.* Xüsusi mülkiyyətçilik ideologiyasının, şəxsiyyətin, fərdin mənafeyini cəmiyyətin, kollektivin mənafeyindən üstün tutan əsas prinsiplərindən biri. *Fərdiyyətçilik təmayülü. Fərdiyyətçilik və xüsusiyyətçilik əhvalı.*

**FƏRƏ** *is.* Cavan toyuq (kəklik). *Çil fərə.* – *Şəhərdən gətirdiyim toyuğumun balaları böyümüş, tüklənmiş, xoruzu, fərəsi bəlli olmuşdu.* A.Şaiq. *Hindən çıxıb tez ağ fərə; Qaqqıldadı birdən-birə.* M.Dilbazi.

**FƏRƏC** *is.* [*ər.*] *klas.* Hüzn, kədər, məyusluqdan sonra gələn sevinc, şadlıq və yaxşı əhval.

◊ **Allah (Yaradan, Tanrı) fərəc versin!** – "Allah kömək eləsin", "uğurlar olsun" mənasında xoş arzu bildirən ifadə. [Banıxanım:] *Sənə kömək istərəm mən xudadan; İşinə fərəc versin böyük Yaradan.* "Aşıq Qərib". [Mir Hadi:] *Allah* [Mirzə Mehdinin] *işinə fərəc versin...* Qantəmir.

**FƏRƏH** [*ər.*] 1. *is.* Sevinc, şadlıq, könül açıqlığı. *Analıq fərəhi. Fərəhdən ağlamaq.* – *İnsanın təbiətində iki ümdə xasiyyət qoyulubdur: biri qəm, biri fərəh; ağlamaq əlaməti-qəmdir, gülmək əlaməti fərəhdir.* M.F.Axundzadə. *Etibar yeridikcə; Fərəhindən az qala; Uçacaqdı bu saat.* İ.Səfərli.

2. **Fərəhlə** şəklində *zərf* – sevinərək, şadlanaraq, fərəhlənərək; sevincək, şad, sevinə-sevinə. *Fərəhlə demək. Fərəhlə oğluna baxmaq.* – *Analar fərəhlə baxırlar sənə; Körpə balaların gülür gözləri.* N.Rəfibəyli. *O qəlbən keçmişdir burdan yüz kərə; Baxmış iftixarla, baxmış fərəhlə.* N.Xəzri.

**FƏRƏHLƏNDİRİCİ** *sif.* Sevindirici, fərəh gətirən, könülaçan. *Fərəhləndirici xəbər. Fevral inqilabı* (1917) *Azərbaycan teatrı və dramaturgiyasına fərəhləndirici bir şey gətirmədi.* Ə.Haqverdiyev.

**FƏRƏHLƏNDİRMƏ** "Fərəhləndirmək"dən *f.is.*

**FƏRƏHLƏNDİRMƏK** *f.* Sevindirmək, şadlandırmaq, könlünü açmaq. *Yaxşı iş adamı fərəhləndirir. Xoş xəbərlə fərəhləndirmək.* – *Al-əlvan çiçəklər öz gözəllikləri ilə cümləni fərəhləndirir idi.* "Məktəb".

**FƏRƏHLƏNMƏ** "Fərəhlənmək"dən *f.is.*

**FƏRƏHLƏNMƏK** *f.* Sevinmək, şadlanmaq, könlü açılmaq. *Atan fərəhlənsin əməllərindən; Vətən çaylarından güc alsın səsin!* B.Vahabzadə. *Sərvinaz qarı evə dönüb hər şeyi hazır görəndə fərəhləndi.* B.Bayramov.

**FƏRƏHLİ** *sif.* 1. Sevindirici, fərəh gətirən, şadlıq gətirən; ürəkaçan, şadlandırıcı. *Fərəhli hadisə. Fərəhli yaşayış.* – [Eyvaz:] *Bu sözlər bahar gecəsinin lal musiqisi kimi mənə fərəhli nəğmələr oxuyurdu.* İ.Əfəndiyev.

2. Şad, şən, sevincək; fərəh, sevinc, şadlıq ifadə edən. *Fərəhli sima. Üzündə fərəhli ifadə hiss olunurdu.* – *Ömrün bağçasında ötəydi hər an; Fərəhli, nəşəli bu quş səsləri.* N.Rəfibəyli.

**FƏRƏHSİZ** *sif.* Fərəh, sevinc gətirməyən; sevincsiz, qəmli, kədərli, ağır. *Fərəhsiz*

*mənzərə.* – [Mehribanın] *fərəhsiz fikirlər beynində bir-birini əvəz etdi..* H.Seyidbəyli.

**FƏRQ** *is.* [*ər.*] 1. Şeyləri, adamları bir-birindən ayıran hər hansı xüsusiyyət, onları bir-birindən ayıran cəhət; təfavüt. *Yaxşı ilə pisin fərqi. Hekayə ilə romanın fərqi. – Köhnə aşnalığın, təzə dostluğun; Fərqi var qış ilə yaz arasında.* Aşıq Ələsgər.

2. İki ədəd, məbləğ, kəmiyyət arasında təfavüt; dəyər ayrılığı. *Hesabdarlıq Salehə ləzzət verir, bəzən bir hesabı beş dəfə sayğaca salır, nəhayət, yeddi qəpik fərqi tapıb ortalığa çıxardığı üçün qalib komandan kimi məğrur durub baxırdı.* Ə.Vəliyev. *Ancaq yaş fərqlərinin çox olmadığına baxmayaraq, Ağca qarı gözə ərindən bir az qoca dəyirdi.* Ə.Əbülhəsən.

◊ **Fərq edilmək** – görünmək, seçilmək, nəzərə çarpmaq. *Havanın üzü ləkəsiz olduğu üçün işıqlı ulduzlar ötədə-bəridə fərq edilirdi.* S.Hüseyn. **Fərq etmək** – ayırmaq, seçmək, fərqli cəhətlərini görmək, fərqləndirmək, ayırd etmək. **Fərq etməz** – fərqi yoxdur, təfavütü yoxdur, birdir, əhəmiyyəti yoxdur. [Gülsabah:] *Fərq etməz. Bu gecə son imtahandır.* C.Cabbarlı. **Fərq qoymaq** – ayrı-seçkilik etmək. *Adamlara fərq qoymaq.* **Fərq olmaq** – aralarında təfavüt olmaq, bir-birindən ayrılmaq, seçilmək, fərqlənmək. *Nola ki, fərq ola namərdlikdən mərd dünyada.* Qövsi. **Fərqi nədir?** – Bir deyilmi? Nə fərqi var? Nə təfavütü var? **Fərqi yoxdur** – b a x **fərq etməz**. *Gedən gedər, qəmi qalar bir içim; Fərqi yoxdu: ya üç mini, ya üçü... Məzar üstə çoxu ağlar görk üçün; Ağlayırsan, sağlığımda ağla sən.* M.Araz. **Fərqinə varmaq** – incə və ya naməlum, gizli bir şeyi anlamaq, anlaya bilmək, dərk etmək. [Yaşlı kişi:] [Şirinnaz] *birdən yarımçılpaq bir halda olduğunun fərqinə vardı.* S.Hüseyn. **Fərqinə varmamaq** – çox fikir verməmək, əhəmiyyət verməmək, çox dərinə getməmək. *Onun sözlərinin fərqinə varma. – Yedi, ləzzət aldı hər bir meyvədən; Ancaq heç fərqinə varmadı, nədən?* M.Dilbazi.

**FƏRQLƏNDİRMƏ** "Fərqləndirmək"dən *f.is.*

**FƏRQLƏNDİRMƏK** *f.* Göz və ya duyğu ilə başqasından və ya başqalarından ayırmaq, seçmək. // Fərqli cəhətinə görə başqasından (başqalarından) ayırmaq, ayırd etmək. *Yaxşı işçi ilə pis işçini fərqləndirmək.*

**FƏRQLƏNMƏ** "Fərqlənmək"dən *f.is.*

**FƏRQLƏNMƏK** *f.* Ayrılmaq, seçilmək, aralarında fərq olmaq, bənzərlik olmamaq. *Yarışda fərqlənmək.*

**FƏRQLİ** *sif.* Aralarında fərq olan, müəyyən xüsusiyyəti ilə o birindən fərqlənən, ayrılan, seçilən, aralarında oxşarlıq olmayan. *Fərqli cəhətlər. Fərqli dünyagörüşü. – Qayəsiz, məqsədsiz keçən bir insan ömrü* [Kərimxana] *bir heç, bir heyvan həyatından fərqli görünmürdü.* M.İbrahimov. *Bir evdə eyni familiya daşıyan iki qadın .. bir-birindən nə qədər fərqli idi*. İ.Qasımov.

**FƏRQSİZ** *sif.* və *zərf* 1. Fərq qoymadan, ayırmadan, laqeyd.

2. **Fərqsizdir** şəklində – fərqi yoxdur, təfavütü yoxdur, əhəmiyyəti yoxdur, birdir. *Biz təhsilin, günəşin qapılarını insan yavrularına fərq qoymadan açdıq. Onlar onsuz da fərqsizdirlər.* M.Müşfiq. *Burda bahar, qış bir, tikanla bir gül; Uğursuz bayquşdan fərqsizdir bülbül.* A.İldırım.

**FƏRLİ** *sif.* 1. Münasib, abırlı, layiqli, yaxşı, əməlli-başlı, yararlı. *Fərli ev. Fərli həyət. Fərli bir şeyim yoxdur ki, bağışlayım. – ..Mal-heyvanı saxlamaq üçün fərli bir tövlə yox idi.* M.İbrahimov. [Babayev:] *Heç olmazsa özünə fərli bir ayaqqabı alaydın.* H.Seyidbəyli.

2. Bacarıqlı, qabiliyyətli, yaxşı, ağıllı-başlı, təpərli. *Fərli övlad. – Fərli oğul neylər ata malını?* (Ata. sözü). *Dağda yol-iz yaxşıdır; Hər yan nərgiz yaxşıdır; Yeddi fərsiz oğuldan; Bir fərli qız yaxşıdır.* (Bayatı).

**FƏRLİ-BAŞLI** b a x **ağıllı-başlı** 1-ci mənada. *Fərli-başlı geyim. - Bayılın neft verən mədəni, düzdür, çoxdur; Fərli-başlı ora ki getməyə bir yol yoxdur.* Ə.Vahid.

**FƏRMAN** *is.* [*fars.*] Ali hakimiyyət orqanının qanun qüvvəsində olan sərəncamı, qərarı. *Azərbaycan Respublikası Prezidentinin fərmanı. // köhn.* Hökmdarın, padşahın yazılı əmri. *O aralıq Kərim xan fərman gön-*

*dərib, Mehralı bəyi Qarabağ xanı təyin etmişdi.* Çəmənzəminli. *Gorus naçalnikindən başlayıb, Gəncə qubernatından ötüb, Tiflisdəki sərdara qədər padşaha xəbər yazılır, yuxarıdan hey fərman gəlirdi.* S.Rəhimov.

**FƏRMAYİŞ** *is.* [*fars.*] *köhn.* Buyurma, əmr etmə; buyruq, əmr, qulluq. *...Başladılar ustanın fərmayişlərini birbəbir əmələ gətirməyə.* C.Məmmədquluzadə. *Onların başı üstündən kənarda durub baxan Firiduna müraciət etdi*: *– Ağa, fərmayişin nədir?* M.İbrahimov. ◻ **Fərmayiş etmək** *klas.* – əmr etmək, buyurmaq. [Şahmar bəy:] *Mən lazım bilirəm sizdən müxlisanə təvəqqe edim ki, siz bir qədər səbr fərmayiş edəsiz.* N.Vəzirov.

**FƏRRAŞ** *is.* [*ər.*] *köhn.* Müxtəlif tapşırıqları yerinə yetirən xidmətçi. [Şah xacəyə:] *Bu saat fərraşı göndər, münəccimbaşını mənim hüzuruma gətirsin.* M.F.Axundzadə. *Şah qəzəblə çağırdı fərraşın; Dedi*: *– Al tiği, kəs bunun başın.* S.Ə.Şirvani.

**FƏRRAŞBAŞI** *is. köhn.* Padşahların sarayında baş fərraş. *İsmayıl kişi ağzını açmaq istəyirdi ki, bu an fərraşbaşının yoğun səsi eşidildi.* P.Makulu.

**FƏRSƏNG, FƏRSƏX** *is.* [*fars.*] *köhn.* Təxminən 5-6 kilometrlik məsafə. [Odabaşı:] *Şəhərdən on-on beş fərsəng kənara sağ-sol göz işlədikcə ağanın əmlakı idi.* Ə.Haqverdiyev. *Ordu Gəncədən İsfahan kəndinə qədər olan on iki fərsəng yolu xalqın şadlıq səsləri, musiqi nəğmələri altında keçirdi.* M.S.Ordubadi.

**FƏRSİZ** *sif.* Əlindən iş gəlməyən; bacarıqsız, qabiliyyətsiz, bivec, bifər. *Fərsiz övlad. Fərsiz uşaq. – Fərsiz qoyunu qurd yeyər.* (Ata. sözü). *Qədim zamanda bir Əhməd adlı tacir var imiş. Bu tacirin Fəraməz adlı fərsiz bir oğlu var imiş.* (Nağıl).

**FƏRSİZLİK** *is.* Əlindən iş gəlməmə; bacarıqsızlıq, qabiliyyətsizlik, biveclik, bifərlik. *Fərsizliyindən ixtisas qazana bilmədi.*

**FƏRŞ** *is.* [*ər.*] Döşənəcək (xalça, palaz, cecim və s.). *Otağa fərş salmaq. Fərşin üstündə oturmaq. – Əvvəlimci otaqda əlvan fərşlər döşənib, qəribə gül və giyah ilə və quş şəkilləri ilə səqfi münəqqəş olmuşdu.* M.F.Axundzadə. *Hücrənin fərşi ibarətdi bir palazdan.* C.Məmmədquluzadə. // Ümumiyyətlə, yerə döşənən hər cür şey. *Təbiət bir bəzəkli-düzəkli gəlinə oxşayır, yaşıl zəmilər, əkin göyləri yerə sərilmiş mərmər fərşlərə bənzəyir.* E.Sultanov.

**FƏRYAD** *is.* [*fars.*] Acı-acı bağırma; nalə, fəğan, ah-nalə, vaveyla. *Oğlunu itirmiş ananın fəryadı. – İnilti, qışqırıq, ah, fəryad, gülüş; Bürüyüb aləmi, dönüb tufana.* M.Rahim. *Bu insan fəryadına; Baxdıqca nələr düşür; Hər baxanın yadına.* B.Vahabzadə. ◻ **Fəryad etmək (qoparmaq, çəkmək, qılmaq)** – acı-acı bağırmaq, ah-nalə etmək, fəğan etmək. *Həqiqət hal, hər həftə fəryad etmək də yaxşı deyil.* N.Nərimanov. *Gəlin... acı bir fəryad çəkib özündən getdi.* Mir Cəlal. // *məc.* İnləmək, ağlamaq, sızlamaq. *Axır günün əvvəl eyləyib yad; Axıtdı sirişkü qıldı fəryad.* Füzuli. *Külək uğuldadıqca çinarın qurumuş yarpaqları fəryad qoparırdı.* Ə.Vəliyev. *Üç addım o tərəfdə kiçik bir qız fəryad edir.* Ə.Məmmədxanlı. **Fəryada gəlmək** – b a x **fəryad etmək**. *Ələmi-layətənahinin əlindən, Hadi; Yeri vardır nə qədər gəlsən əgər fəryadə.* M.Hadi. // Qışqırıq, bağırtı, çığırtı. *Xəstənin fəryadı. – İçəridən boğuq bir səs gəldi, ani bir fəryad duyuldu.* Çəmənzəminli. ◻ **Fəryad qoparmaq (etmək)** – qışqırmaq, bağırmaq, çığırtı salmaq. // İmdada, köməyə çağırış səsi. *Fəryadına yetişən olmadı. – Heç kəs Nəbinin səsini, naləsini, fəryadını eşitmirdi..* Ə.Abasov.

**FƏRZ** *is.* [*ər.*] 1. Güman, təxmin, ehtimal; bir şeyi var və ya yox sayma. ◻ **Fərz edək (ki)**... – tutaq ki... *Belə fərz edək ki, indi ramazan daxil oldu.* C.Məmmədquluzadə. **Fərz etmək** – güman etmək, ehtimal etmək, təxmin etmək, hesab etmək. *Mən belə fərz edirəm ki... – Bir dəqiqəliyə belə fərz eləyək ki, Midhət .. günahkardır və ona verilən ağır cəza da ədalətlidir.* M.Hüseyn. **Fərz olunmaq** – güman edilmək, ehtimal edilmək, təxmin edilmək, niyyətdə tutulmaq.

2. Vacib, zəruri, daha artıq lazım (vacib) olan şey. *Ey insanlar, fərz deyilmi bizlərə;*

*Rəhm eyləmək, əl tutmaq acizlərə?* A.Səhhət. ☐ **Fərz olmaq** – vacib olmaq, zəruri olmaq, lazım olmaq. *Hələ ki müqərrər oldu getmək; Fərz oldu bu sirri zahir etmək.* Füzuli.

**FƏRZƏN** *zərf* [*ər.*] *klas.* Fərz, təxmin yolu ilə; ehtimalən, tutaq ki, fərz edək ki. *Fərzən ehtimal edib deyək ki, bizdən savayı bütün dünyanın arvadları özlərini öldürüb çalışdıqları və onlara bir çox kişilər də yardım etdikləri üçün onlara bir az haqq və ixtiyar verilsin.* C.Məmmədquluzadə.

**FƏRZİYYƏ** *is.* [*ər.*] Bir şey haqqında təxmini mülahizə; güman, ehtimal, fikir, zənn. *Kainatın əmələ gəlməsi haqqında fərziyyə. Onun fərziyyəsinə görə... Fərziyyə həqiqətə çevrildi.* – [Şeyda] *uzun müddət yoxlamadığı, götür-qoy eləmədiyi bir fərziyyəni ən yaxın dostlarına belə açıb söyləməzdi.* M.Hüseyn.

**FƏS** *is.* [Mərakeşdə şəhər adından] Bəzi Şərq ölkələrində kəsik konus şəklində, əsasən qırmızı rəngli, qotazlı baş geyimi. *Qırmızı fəs, qırmızı ipək qurşaq, sırmalı arxalıq Rüstəm bəyə çox yaraşırdı.* Çəmənzəminli. [Mirzə Süleyman bəy] *arxalığı, çuxanı atıb, kostyum, qalstuk geymişdi, papağı çıxardıb fəs qoymuşdu.* B.Talıblı.

**FƏSAD** *is.* [*ər.*] 1. Nifaq, qarışıqlıq, fitnə, intriqa. *Bizdə görünməz nə fəsadü nifaq; İşləməyə bir-birimizdən qoçaq.* M.Ə.Sabir. *Hiyləgər ruhanilərin fəsad torlarını yırtıb, o tordan çıxmaq üçün zəhmət çəkib dünya elmlərini təhsil eləyirlər.* C.Məmmədquluzadə. ☐ **Fəsad düşmək** – hərc-mərclik düşmək, qarmaqarışıqlıq düşmək, asayiş, əmin-amanlıq pozulmaq, dava düşmək, nifaq düşmək. **Fəsad salmaq** – hərc-mərclik salmaq, ara qarışdırmaq, nifaq salmaq, intriqa salmaq. *Aralarına fəsad salmaq. – Həm də olurdu uşaq dərsdə bədetiqad; Məzhəbə rəxnə vurub, dinə salırdı fəsad.* M.Ə.Sabir.

2. *tib.* Xəstəliyin törətdiyi ağır, qorxulu nəticələr; pozuqluq. *Deyiblər ki, tənbəllik bədən üçün fəsaddır.* "Qabusnamə".

**FƏSADÇI** *is.* Araya fəsad, fitnə salan, nifaq salan, fəsad törədən, aravuran, araqarışdıran adam; intriqaçı. [Qətibə:] *Allahtaalaya çox şükür olsun ki, indiyə qədər məmləkətin başına fəlakət gətirən fitnə və fəsadçılar rədd olub getdilər.* M.S.Ordubadi.

**FƏSADÇILIQ** *is.* Fəsadçının işi, peşəsi; fəsad, fitnə düzəltmə, araqarışdırma, intriqa salma; intriqaçılıq.

**FƏSAHƏT** *is.* [*ər.*] Fikri səlis, aydın, düzgün və məntiqi ifadə etmək bacarığı, natiqlik məharəti; gözəl danışmaq, anlatmaq qabiliyyəti. *Natiqin nitqindəki fəsahət.* – [Əmiraslan ağa:] *..Siz də o fəsahət, bəlağət qapısı olan ağzınızı açıb, camaatı bizim itaətimizə çağıracaqsınız.* S.S.Axundov. [Naşad] *bütün fəsahət və bəlağətini topladı.* S.Hüseyn.

**FƏSAHƏTLİ** *sif.* Aydın, gözəl, səlis, düzgün. *Fəsahətli nitq. - Əmir Bus-Suvar böyük şah idi, dediyini eyləyən, müdrik ləyaqətli, ədalətli, şücaətli, fəsahətli, dini sevən, uzaqgörən idi..* "Qabusnamə".

**FƏSƏLİ** *is.* Arasına yağ sürtülmüş qat-qat xəmirdən tavada və ya təndirdə bişirilən çörək, qoğal. *Bizim gəlinlərin bayramqabağı; Fəsəli yaymağı yadıma düşdü.* S.Vurğun.

**FƏSİH** *sif.* [*ər.*] Fəsahətli, gözəl, aydın, təmiz, düzgün, səlis (tələffüz, nitq haqqında). *Fəsih nitq. Fəsih* (z.) *danışmaq. – Axund Molla Sadıq çıxdı minbərə, bir fəsih xütbədən sonra başladı..* M.F.Axundzadə.

**FƏSİL** *is.* [*ər.*] 1. İlin bölündüyü dörd mövsümdən hər biri; mövsüm. *Qış fəsli. – Hər fəsildə üç ay var; Üç ulduz var, üç ay var.* (Bayatı). *Hər ilin dörd fəsli var və hər fəslin də öz təğazası var.* C.Məmmədquluzadə. // İlin çoxlu meyvə yetişən, bitkilərin çoxlu çiçək açan dövrü. *Meyvə fəsli. – Fəsligüldür, aləm içrə novbahar olmuş, könül!* Ə.Nəzmi. *Çiçək fəsli deyil indi! Barıt vardır havalarda.* S.Vurğun.

2. Kitabın, məqalənin, sənədin və s.-nin nömrə və ya ayrıca sərlövhə ilə işarələnən hissəsi. *Əsərin ikinci fəsli. Birinci fəsli ixtisar etmək. – Bəzən nöqsan da olur; Sevimli bir romanın; Gözəl fəsillərində.* İ.Səfərli.

**FƏSİLƏ** *is.* [*ər.*] *biol.* Quruluşca oxşar, mənşəcə bir-birinə yaxın bir neçə heyvan və ya bitki cinsinin əmələ gətirdiyi qrup. *Quru otlar içərisində ən yaxşıları – paxla və taxıl fəsiləsinə mənsub olan təbii biçənək*

*otları*: *yonca, üçyarpaq, vələmir və külül* (*çölnoxudu*) *qarışığı, sudanotu və sair əkmə otlardır. – Bitkini təyin etmək dedikdə, onun hansı fəsiləyə, cins və növə aid olduğunu müəyyən etmək nəzərdə tutulur.* H.Qədirov.

**FƏTH** *is.* [*ər.*] 1. Bir şəhər və ya ölkəni silah gücü ilə zəbt etmə, alma. // Qələbə, zəfər, qalibiyyət. [Mustafa xan:] *Ümidini Allaha bağla, inşallah, fəth biz ilə olar.* Ə.Haqverdiyev. ◻ **Fəth etmək** – 1) zorla, silah gücü ilə almaq, tutmaq, zəbt etmək, işğal etmək. *Düşmən qalasını fəth etmək.* – [Faşist başçıları] *hərbi qüvvələrini bütün Avropanı fəth etməyə hazırlayırdı*(*lar*). M.İbrahimov; 2) *məc.* özünə tabe etmək, yiyələnmək, öz xeyrinə işlətmək. *Təbiəti fəth etmək. - Bir oxun səngəri dağ olsa əgər; Uçar, yer üzünü bütün fəth edər.* Şəhriyar. *Göyləri fəth edən bir ana tərlan; Kim deyir balaykən yıxılmamışdır.* M.Araz; 3) *məc.* tutmaq, qaplamaq, basmaq. *Yanğın ətrafı fəth etdi;* 4) *məc.* məftun etmək, valeh etmək, əsir etmək. *Könüllər yolçusu o munis gözəl; Min ürək fəth edir hər keçən anda.* S.Vurğun. // *məc.* İradəsini əlindən almaq, özünə ram etmək. *Murtuzun xoş danışığı Gülnazı tədricən fəth etməyə başlayırdı.* Q.İlkin. *Dünyanı fəth etsə ana hörməti; Yaradar dünyada əsil cənnəti.* Şəhriyar.

**FƏTHƏ** [*ər.*] b a x **zəbər**.

**FƏTİR** *is.* [*ər.*] Mayalı və ya mayasız xəmirdən, bəzən yağ, cızdaq, və s. qatılaraq təndirdə və ya sacda bişirilən çörək. *Mayalı fətir. Fətir bişirmək. Fətir üçün xəmir yoğurmaq. – Sona xala əlində bir podnos, içində .. qaymaq, yağ, yağlı fətir .. masaya süfrə salıb, məni oraya təklif etdi.* S.S.Axundov. *Qara oğlan əlindəki fətiri yeyib qurtardı, ovcu ilə dodaqlarını sildi.* M.Hüseyn. // *etnoqr.* Toyda oğlan evindən qız evinə göndərilən xüsusi yapılmış iri yağlı çörək.

**FƏTİRSİFƏT** *sif.* İri, kök, girdə sifəti olan. *Fətirsifət arvad.*

**FƏVVARƏ** *is.* [*ər.*] 1. Təzyiq altında fışqıran su şırnağı; bu şırnağı fışqırtmaq üçün düzəldilən hovuz və qurğular; fontan. *Fəvvarəni işə salmaq. Bakı bulvarının gözəl fəvvarələri var. – Gözüylə seyr edir, zövq alır qəlbən; Sərin hovuzlardan, fəvvarələrdən.* S.Vurğun. [Çingiz Qəndaba:] *Bir saatdan sonra fəvvarənin yanında səni gözləyəcəyəm, təkcə gəl, sözüm var.* B.Bayramov.

2. *məc.* Bitməz-tükənməz, arasıkəsilməz şey, axın. *Tüstü fəvvarəsi. Toz fəvvarəsi. – Hər tərəfdə top mərmilərinin göyə qaldırdığı qara torpaq fəvvarələri döyüş meydanını tufana tutulmuş fantastik bir meşəyə döndərmişdi.* Ə.Məmmədxanlı.

◊ **Fəvvarə vurmaq** – sürətlə, gur surətdə axmaq, tökülmək.

**FƏVVARƏLƏNMƏ** "Fəvvarələnmək"-dən *f.is.*

**FƏVVARƏLƏNMƏK** *f.* Fəvvarə kimi vurmaq, qalxmaq, püskürmək, fışqırmaq. *Su fəvvarələnirdi. – Tankın ətrafından tüstülər və alovlar fəvvarələndi.* Ə.Əbülhəsən.

**FƏVVARƏLİ** *sif.* Fəvvarəsi olan; fontanlı. *Fəvvarəli bağça. Fəvvarəli həyət. – Budur, fəvvarəli hovuzun kənarında bir dəstə adam əyləşmişdir.* Mir Cəlal.

**FƏZA** *is.* [*ər.*] 1. Kainatda sonsuz boşluq; göy, asiman. *Ulduzlu fəza dəniz üzərinə çevrilmiş bir süzgəcə bənzəyirdi.* M.S.Ordubadi.

2. *məc.* Yüksəklik, ənginlik. *Yenə də insanın xəyal şahpəri; Gəzir fəzaları, göy dənizləri.* S.Vurğun. *Qüdrətim olsaydı qanad açardım; Sonsuz fəzaları yarıb uçardım.* Ə.Kürçaylı.

**FƏZİLƏT** *is.* [*ər.*] 1. İnsanda ağıl, kamal, elm-mərifət, mərdlik, yüksək mənəviyyat, alicənablıq kimi sifətlərin ümumi adı. // Müdriklik, kamillik; ehtiram doğuran sifətlər. [Sevda:] *Sus, onda fəzilət var; Qüdrət və cəsarət var.* H.Cavid. [Yaşlı kişi:] *Buraya gəldikdə mənə* [Şeyx Yəhyanın] *fəzilətindən çox şeylər söyləmişdilər.* S.Hüseyn.

2. *məc.* Dəyər, qiymət, məziyyət. *..Bir kəs tapılmaz ki, elmin fəzilət və mənfəətini və onun cümləyə zəruri olmasını inkar edə.* F.Köçərli.

**FƏZİLƏTLİ** *sif.* Fəzilət sahibi olan, fazil; yüksək mənəvi keyfiyyətlərə malik olan. *Fəzilətli bir şəxs.*

**FINDIQ** *is.* Bərk qabıq içində ikibölümlü ləpəsi olan qozaoxşar, lakin ondan kiçik meyvə; həmin meyvənin yabanı və ya əkilən kolu. *Fındıq meşəsi. Fındığın içi boşdur.*

– *Gözəl fındıq sındırır, tut qurusu arıtlayır, Həbib yavaş-yavaş yeyirdi.* Ə.Vəliyev.

**FINDIQBURUN** *sif.* Balaca, girdə və ucu bir qədər qalxıq burnu olan. *Fındıqburun uşaq.* – [Nisə xanım Şeydaya:] *Nə olub? Yoxsa körpə* [Vahidovların] *fındıqburun nəslinə çəkib?* Ə.Məmmədxanlı.

**FINDIQÇA** b a x **çırtıq** 1-ci mənada. *Fındıqça çalmaq.*

**FINDIQLI** *sif.* Tərkibində fındıq olan. *Fındıqlı konfet. Fındıqlı halva.*

**FINDIQLIQ** *is.* Çoxlu fındıq ağacı bitmiş və ya əkilmiş yer. *Fındıqlığı sulamaq. – Başqa bir tərəfdə, dik yalın o üzündə .. fındıqlıq meşəsi başlanırdı.* S.Rəhimov.

**FINDIQSINDIRAN** *is.* Fındıq, qoz, badam kimi meyvələrin qabığını sındırmaq üçün alət; sıxac.

**FINXIRIQ** b a x **fınxırtı**.

**FINXIRIŞMA** "Fınxırışmaq"dan *f.is.*

**FINXIRIŞMAQ** *qarş.* Fınxırmaq (çoxları haqqında).

**FINXIRMA** "Fınxırmaq"dan *f.is.*

**FINXIRMAQ** *f.* 1. Havanı burun deşiklərindən güclə buraxmaqla səs çıxarmaq. *İnək fınxırır. – Buğa fınxırıb dik ayağa qalxdı.* M.Rzaquluzadə. *At fınxırıb iki dal ayaqları üstə göyə qalxdı.* "Koroğlu".

2. Səs çıxara-çıxara havanı, buxarı, yaxud işlənmiş qazı kəsik-kəsik bayıra buraxmaq. "*Qaz*" *maşını... fınxıraraq öz yoluna davam edir..* H.Seyidbəyli.

**FINXIRTI** *is.* Fınxırarkən çıxarılan səs; fınxırıq. *İnəyin fınxırtısı. Fınxırtı səsi. – Qırmanc səsi atların fınxırtısına qarışdı, ancaq fayton yenə də irəliləmədi.* M.Hüseyn. *Ancaq atların burnundan çıxan fınxırtılarla ayaqlarının altından qopan xırdaca daşların səsləri eşidilirdi.* S.Rəhimov.

**FIR** *is.* 1. Həşəratın təsirindən və s. səbəblərdən bitkilərin müxtəlif yerlərində əmələ gələn şiş; donqar. *Tut ağacının fırı. – Palıd ağaclarının düyünləri və yumru fırları irəliyə doğru çıxırdı.* S.Rəhimov.

2. *dan.* İkigüvənli dəvənin güvənlərindən hər biri, hörgücü. *Dəvənin fırı.*

3. *məc.* Gərəksiz, lazımsız, heç bir işə yaramayan şey haqqında. [Əli Rüstəm bəyə:] *Həyatın bir üzvündən baş vermiş çirkin bir fıram, kəsib atılmaqdan başqa bir çarəm yoxdur!* Çəmənzəminli.

◊ **Fırı yatmaq** *dan.* – acığı, hirsi soyumaq. *Bir az atılıb-düşdü, axır ki fırı yatdı.*

**FIRÇA** *is.* Rəng çəkmək, yapışqan sürtmək və s. üçün dəstəyə bərkidilmiş tük, qıl və. s. topasından ibarət alət. *Rəngsaz fırçası. Fırça ilə kağıza yapışqan sürtmək. – Xınalıq gecələrinin gözəlliyi mahir bir rəssam fırçası ilə canlansa, bu lövhəyə baxanlar onun həqiqətinə çətin inanarlar.* R.Rza. *Əsmər, bir əlində palitra, o biri əlində fırça, iri qovaq ağacının altında molbertin qabağında dayanıb şəkil çəkirdi.* M.Süleymanov. // Üz qırxanda sabun sürtmək üçün kiçik şotka. *Sübhanverdizadə camı bir əlinə götürüb, ayna qabağına yeridi və fırça ilə üzünü sabunlayıb suvadı.* S.Rəhimov.

**FIRÇILDAMA** "Fırçıldamaq"dan *f.is.*

**FIRÇILDAMAQ** *f.* Fırçıltı səsi çıxarmaq, fırç-fırç eləmək. *Kosa içində su fırçıldayan* (f.sif.) *qaloşlarını tappıldada-tappıldada qayıdıb çöl tərəfdən* [*Sübhanverdizadənin*] *kabinetin qapısına bir təkan vurdu, qapı açılmadı.* S.Rəhimov. *Yapışqandan pis Muğan palçığı maşının təkərləri altında fırçıldayaraq dörd tərəfə sıçrayırdı.* M.İbrahimov.

**FIRÇILTI** *is.* Bir cismin palçığa və ya başqa qatı, suvaşqan bir şeyə batarkən çıxardığı səs.

**FIRFIRA** *is.* 1. Çox iti fırlanarkən bir ucu üzərində dik vəziyyətdə duran dairə və ya şar şəklində oyuncaq; fırlanqıc. *Fırfıra fırlatmaq.*

2. *fiz.* Dayaq nöqtəsi ətrafında istənilən sürətlə fırlana bilən bərk cisim.

◊ **Fırfıra kimi fırlanmaq** *məc.* – yaltaqlanmaq, quyruq bulamaq, qulluq göstərmək. *Yarməmmədlə* [Salman] *fırfıra kimi sədrin başına fırlandılar.* M.İbrahimov. *Leylək Zərrintac xanımın qabağında nə qədər qulluq göstərib fırfıra kimi fırlansa da .. xanım onu saya salmırdı.* S.Rəhimov.

**FIRIQ** *sif.* və *zərf* Əngəl, pis, yaman, fəna (adətən "işi" sözü ilə bərabər). *Onun işi fırıqdır. – Şeytan işi fırıq görüb qaibə çəkildi.* (Nağıl).

**FIRILDAQ** *is.* 1. Hiylə, kələk, dolab, badalaq, biclik. *Hərifin fırıldağını başa düşmək.* – [Molla İbrahim:] *Şeyx Yəhyanın bütün fırıldaqlarını açıb, Xorasan camaatına elan etmək mənim borcum olsun.* S.Hüseyn. [Musa:] *De görüm, indi nə fırıldağın var?* M.İbrahimov. ◻ **Fırıldaq gəlmək (düzəltmək, işlətmək)** – kələk işlətmək, dolab gəlmək, biclik işlətmək, hiyləbazlıq eləmək, badalaq qurmaq. *Mən az görməmişəm badalaqları; Min fırıldaq gələn o alçaqları!* S.Vurğun. [Ataş:] *Mən bilirdim,* [Veysəlgili] *əvvəl-axır belə fırıldaq düzəltməli idilər.* Ə.Vəliyev.

2. *dan.* Fırıldaqçı mənasında. *Fırıldağın biridir.* – [Fərrux Natiqə:] *Ədə, sən başdan-ayağa fırıldaqmışsan ki!* B.Bayramov.

**FIRILDAQÇI** *is.* Fırıldaq işlədən, kələkbaz, hiyləbaz, adamaldadan, haramzadə, aferist. [Firəngiz:] *Fırıldaqçılara, ..Muxtar Qaradağlı kimi üzdəniraq mütəxəssis ferma müdirinə aman yoxdur!* B.Bayramov. // Sif. mənasında. *Fırıldaqçı adam.* [Dükançının] .. *türkəçarə ilə məşğul olan fırıldaqçı bir bacanağı vardı.* Ə.Vəliyev.

**FIRILDAQÇILIQ** *is.* Fırıldaqçının işi, peşəsi; kələkbazlıq, hiyləgərlik, haramzadəlik. *Ana zəifdir, lakin dünyanın güclülərinin və zalımlarının hiyləgərliyi və fırıldaqçılığına qarşı onun qüdrətli silahı təmizlik və düzlükdür.* M.İbrahimov. ◻ **Fırıldaqçılıq etmək** – kələk gəlmək, kələk, hiylə işlətmək, dolab gəlmək; fırıldaq, biclik işlətmək, haramzadəlik eləmək. *Ənisə açıqdan-açığa görürdü ki, Muxtar uydurduğu yalanla fırıldaqçılıq edir, atasını aldadır.* S.Hüseyn.

**FIRILDAMA** "Fırıldamaq"dan *f.is.*

**FIRILDAMAQ** b a x **fırlamaq**.

**FIRILDATMA** "Fırıldatmaq"dan *f.is.*

**FIRILDATMAQ** b a x **fırlatmaq**.

**FIRLAĞAN** b a x **fırfıra**. *Hacıyev sağ əlini göyə qaldıraraq, fırlağan oynadırmış kimi havada neçə dəfə tərpətdi.* Mir Cəlal.

**FIRLAMA** "Fırlamaq"dan *f.is.*

**FIRLAMAQ** 1. B a x **fırlatmaq**. *Tahir sükanı qaba və kəskin hərəkətlərlə o yan-bu yana fırlayır, maşının .. hərəkətinə mane olurdu.* M.Hüseyn.

2. *f.* Yerindən oynamaq, pırtlamaq. *Gözləri yerindən fırladı.*

**FIRLANDIRICI** *sif.* Bir şeyi öz oxu ətrafında fırlandıran, hərlədən, dolandıran. *Fırlandırıcı qurğu.* – *Qaldırıcı və fırlandırıcı mexanizmlər buruq içərisində, nasoslar və energetik qurğular isə buruğun yanında tikilmiş saraylarda yerləşdirilir.* S.Quliyev. // İs. mənasında. *Fırlandırıcını dəyişmək. Yeni markalı fırlandırıcı.*

**FIRLANDIRMA** "Fırlandırmaq"dan *f.is.*

**FIRLANDIRMAQ** b a x **fırlatmaq** 1-ci mənada. *Çarxı fırlandırıb yerinə salmaq.*

**FIRLANĞIC** *is.* 1. Üfüqi və ya şaquli fırlanan attraksion növü. *Fırlanğıca minmək. Böyük bir fırlanğıc uşaqları, yeniyetmə oğlanları, qızları böyük sürətlə havada fırladır.*

2. B a x **fırfıra**.

3. *xüs.* Qazma qurğusunun fırlanan mili. *Gilli məhlul nasoslardan tənzimedici kondensatorlara, oradan da rezin və ya elastik metal şlanq və fırlanğıcdan keçərək qazma kəmərinə daxil olur.* S.Quliyev.

**FIRLANMA** "Fırlanmaq"dan *f.is.*

**FIRLANMAQ** *f.* 1. Öz oxu ətrafında dairəvi hərəkət etmək, dolanmaq, hərlənmək, dövr etmək. [Qüdrət:] *Baxıram, təkərlər fırlanır, motorlar işləyir, hər şey hərəkət edir.* C.Cabbarlı. *Dəyirman pərləri elə fırlanır ki, görmək olmur.* Mir Cəlal.

2. Bir şeyin ətrafına dolanmaq, hərlənmək, o yan-bu yanına keçmək. *Evin ətrafına fırlanmaq.* – *..Qənbərli dönüb motorun dövrəsinə fırlandı.* S.Rəhimov.

3. Rəqs zamanı dönmək, dolanmaq, hərlənmək. *Qaraca qız elə bir tərzdə fırlandı ki, baxanların nəzərində bir şar kimi göründü.* S.S.Axundov. *Vals oynayan oğlan və qızlar bir-iki-üç, bir-iki-üç sayı ilə fırlanırlar.* Ə.Bədəlbəyli.

4. Konkret bir məqsədi olmadan gəzmək; gəzişmək, gəzinmək. *Parkda fırlanmaq.* – [Qurban:] *Heç, elə bazara çıxdım, bir az fırlandım, qayıtdım.* Ə.Haqverdiyev. *Anası* [Tahirin] *çox o yan-bu yana fırlandığını hiss edib, xəmirdən əllərini çıxarmayaraq arxaya sarı boylandı..* M.Hüseyn.

5. Kiçik bir yerdə ora-bura hərəkət etmək; gedib-gəlmək, gəzinmək, gəzişmək.

*Gənc bir doktor daima* [Yaqutun] *başı yanında firlanırdı.* Ə.Məmmədxanlı.

**FIRLATMA** "Fırlatmaq"dan *f.is.*

**FIRLATMAQ** *f.* 1. Fırlandırmaq, dolandırmaq, hərləndirmək. *Maşının sükanını firlatmaq. – Vaqif başını aşağı salıb barmağındakı əqiq üzüyü firladırdı.* Çəmənzəminli. *Şahmar bu fikirdə idi ki, adam istəsə yeri tərsinə firlada bilər.* B.Bayramov.

2. Bir şeyi şiddətlə və saymazyana atmaq, tullamaq, tolazlamaq. *Hirsindən boşqabı götürüb həyətə firlatdı. – Firəngiz bənövşə dəstəsini stolun üstünə firlatdı.* B.Bayramov. // Atmaq. *Yusif Həmzənin nazik boynundan yapışıb onu qapının ağzına firlatdı.* B.Bayramov.

**FIRLI** *sif.* 1. Fırı olan (b a x **fır** 1-ci mənada). *Fırlı ağac.*

2. Hörgüclü, güvənli.

**FIRTIQ** *is.* Burundan axan selik.

**FIRTIQLI** *sif.* 1. Fırtıqla dolu, fırtığı axan. *Uşaq firtıqlı burnunu çəkib məyus nəzərlərini anasına dikdi..* M.İbrahimov.

2. Fırtığa bulaşmış, fırtığa batmış.

**FIRTINA** *is.* 1. Güclü küləklə dənizin şiddətlə dalğalanması; qasırğa, tufan. *Dənizdə firtına var. – Elə bu vaxt firtına; Daha da bərk gurladı.* İ.Səfərli. *Sakit görünsə də çox zaman dəniz; Orda çovğun da var, firtına da var.* H.Arif. // Fırtınalı hava. *Bu firtınada hara gedirsən? Fırtınadan bayıra çıxmaq olmur.*

2. *məc.* Coşqun, gurultulu, təlatümlü, mübarizələrlə, keşməkeşlərlə dolu həyat mənasında. *Günəş çıxdı səhər tezdən; Fırtınadan doğuldum mən.* N.Xəzri.

**FIRTINALI** *sif.* 1. Fırtınası olan, boranlı, qasırğalı, coşqun. *Fırtınalı hava. Fırtınalı okean. – Fırtınalı göylərimi yaxmaq istər ildırımlar; Nə zaman ki qərib ruhum yad ellərdən cana doyar.* Ə.Cavad. *Divarlarda firtınalı dəniz batan gəmi, tufan vaxtı dənizdə yanğın və bu kimi mənzərələr rəsm edilmişdi.* M.Süleymanov.

2. *məc.* Keşməkeşli, qovğalı, boranlı, gurultulu hadisələrlə dolu. *Fırtınalı zəmanə. – 1904-cü ilin firtınalı günləri idi.* A.Şaiq. // *məc.* Coşqun. *Soltan .. firtınalı bir gənclik həyatı keçirmişdir.* İ.Əfəndiyev.

**FISILDAMA** "Fısıldamaq"dan *f.is.*

**FISILDAMAQ** *f.* Fısıltı səsi çıxarmaq, fısfıs eləmək. *Bir az da keçəndən sonra maşın fısıldayıb dayandı.* Ə.Haqverdiyev. *Qubernator yenə əvvəlki vəziyyətində dayanıb, qıyıq gözlərini ona zillədi. Aşkarca fısıldamağa başladı.* İ.Şıxlı.

**FISILDAŞMA** "Fısıldaşmaq"dan *f.is.*

**FISILDAŞMAQ** *qarş.* Fısıldamaq, fısıltı səsi çıxarmaq (çoxları haqqında).

**FISILTI** *is.* Ağır nəfəs alan adamın bir-birinə qapanmış dişləri arasından çıxardığı səs; fıs-fıs səsi. *Yatan yoldaşların xorultusu, fısıltısı otağı bürümüşdü.* A.Şaiq. *Cahandar ağanın dişləri kilidləndi. Onun fısıltısını qulağının dibində eşidən Mələk nə edəcəyini bilmədiyindən, yumaq kimi büzüşdü.* İ.Şıxlı. // *məc.* İşləyən maşın, motor və s.-nin çıxardığı həmin səsə oxşar səs. *Maşının fısıltısı. – Parovozun ağzını yamsılayırmış kimi tramvayın motoru da kəskin bir fısıltıdan sonra dayandı.* Qantəmir.

**FISQIRIQ** 1. B a x **fit**. *Ortada bir sükut vardı. Yalnız elektrik qatarının bir-birini təqib edən əsəbi fısqırığı eşidilirdi.* S.Hüseyn.

2. *məc.* Hay-küy, qiyamət, həngamə, qalmaqal. *Fısqırıq qalxmaq.* – [Gilə] *qapını açıb bayırı Əvəzə göstərərək dedi*: *– A kişi, heç sən bu həyətdəki fısqırığı eşitmirsən?* Ə.Vəliyev. [Nazlı Gülzara:] *Şəhərdə yaman fısqırıqdır, xala, danışırlar ki, ingilislər fəhlələrə güllə açıblar.* Ə.Məmmədxanlı.

◊ **Fısqırığa basmaq** – b a x **fitə basmaq** ("**fit**"də). *Onda da camaat tökülmüşdü. Kişini fısqırığa basmışdılar.* Mir Cəlal.

**FISQIR(T)MA** "Fısqır(t)maq"dan *f.is.*

**FISQIR(T)MAQ** *f. dan.* Çəkmək (papiros, siqaret və s.). *Siqaret fısqırtmaq. – Molla Qafar isə bol yeməyi gördükdə rahatca bardaş qurub, .. çubuğunu təmizləyərək fısqırtdı, tənbəki ilə doldurub, damağına aldı.* S.Rəhimov. [Xəlil:] *Mənim o böyük-kiçik tanımayan, papiros fısqırdan* (f.sif.) *cavanlardan zəhləm gedir.* S.Rəhman.

**FISTIQ** *is. bot.* Hamar açıq-boz qabığı və bərk oduncağı olan qollu-budaqlı iri ağac. *Dərənin hər iki tərəfində bitmiş yüzillik palıd və fıstıq ağaclarının budaqları ahəstə əsən nəsimdən hərəkətdədir.* M.F.Axundzadə.

**FISTIQKİMİ(LƏR)** *cəm bot.* Fıstıq, palıd, şabalıd və s.-nin daxil olduğu bitki fəsiləsinin adı.

**FISTIQLIQ** *is.* Çoxlu fıstıq ağacı əkilmiş və ya bitmiş yer, fıstıq meşəsi.

**FIŞILDAMA** "Fışıldamaq"dan *f.is.*

**FIŞILDAMAQ** *f.* 1. Fışıltı səsi çıxarmaq (b a x **fışıltı** 1-ci mənada). *Bir az irəlidə, yolun üst tərəfində yer fışıldayır, ağ bir fəvvarə göyə qalxırdı.* S.Rəhimov.

2. Fışıltı səsi çıxarmaq (b a x **fışıltı** 2-ci mənada). *İlanlar fışıldayır kol-koslar arasından.* S.Rüstəm.

**FIŞILTI** *is.* 1. B a x **fışqırtı**. *Borulardan fışıltı ilə qalxan buxar göy üzündə əriyib yox olurdu.* H.Seyidbəyli. // Şırıltı. *Şamo uca dağların geniş ətəklərini yalayıb gedən bu şıltaq suyun fışıltısı altında dayanıb ətrafa boylandı.* S.Rəhimov.

2. İlanın çıxardığı səs. *Gürzənin fışıltısı.*

**FIŞQIRIQ** b a x **fit** 1 və 2-ci mənalarda. *Gecə saat iki idi, küçədə binanın qarşısında bir faytonun dayandığı hiss edildi, iki dəfə də fışqırıq səsi gəldi.* M.S.Ordubadi. *Bir fışqırıq səsi eşidib haman; Gözətçi şəkləyir qulaqlarını.* B.Vahabzadə. □ **Fışqırıq çalmaq** – b a x **fit çalmaq** ("**fit**"də).

◊ **Fışqırığa basmaq** – b a x **fitə basmaq** ("**fit**"də). *..Hamı birdən əlini ağzına aparıb bəyi fışqırığa basdı.* Ə.Vəliyev.

**FIŞQIRMA** "Fışqırmaq"dan *f.is.*

**FIŞQIRMAQ** *f.* Dar bir yerdən təzyiq altında şiddətlə sıçramaq, çıxmaq, vurmaq. *Yüzbaşı yerə yıxılmışdı, boynundan qan fışqırırdı.* Çəmənzəminli. *Dəlib daşın bağrını; O fışqıran suya bax!* B.Vahabzadə.

**FIŞQIRTI** *is.* 1. Fışqıraraq çıxan suyun, mayenin, qazın, buxarın və s.-nin çıxardığı xəfif səs; fışıltı. *Qazın fışqırtısı. – Məmməd bəy təpədə birisinə çatıb, arxadan qılıncı boynuna endirdi. Qan fışqırtı ilə atın yəhərəsbabına səpildi.* Çəmənzəminli. [Bulaqların] *bəziləri daşların sinəsindən fışqırtılə fəvvarə vurur, bəzisi isə pıqqapıqla, sanki qaynaya-qaynaya çıxır.* Ə.Abasov.

2. Püskürmə, püskürtü.

**FIŞTIRIQ** b a x **fışqırıq**. □ **Fıştırıq çalmaq** – b a x **fışqırıq çalmaq** ("**fışqırıq**"da). *Qaraş keyfi saz olduğundan .. fıştırıq çala-çala düşərgəyə getdi.* M.İbrahimov.

**FİÁSKO** *is.* [*ital.*] İflas, uğursuzluq.

**FİBRA** *is.* [*lat.*] Toxuma.

**FİDAN** *is.* Ağac və kolların kötüyündən göyərən və sonradan başqa yerdə əkilən cavan ağac. *Körpə fidanlar; Deyir: – Qırmayın; Bizi, nadanlar!* M.Seyidzadə. // Ümumiyyətlə, yenicə yetişən cavan ağac və ya kol. [Günəş] *bağçada tut, əncir, yasəmən fidanları əkmiş, evi, həyəti nizama salmışdı.* A.Şaiq. *Pöhrələr, şitillər indi körpədir; Fidanlar on qarış deyil hələlik.* O.Sarıvəlli. // *məc.* Obrazlı təşbehlərdə. *Ürəyində məhəbbətin; İlk fidanı yarpaq açır.* N.Rəfibəyli.

**FİDANLIQ** *is.* Çoxlu fidan göyərmiş və ya əkilmiş yer. [Gözətçi qadın Rüstəm bəyə:] *Gecə atları buraxmışlar, bağçanı korlamış, fidanlığı alt-üst etmişdir.* Çəmənzəminli.

**FİDEÍST** [*fr.*] Fideizm tərəfdarı. *Fideistlər elmin təsir dairəsini məhdudlaşdırırlar.*

**FİDEİZM** [*fr.* əsli *lat.* fides – inam və ...ism] Dini etiqadı elmi idrakdan üstün tutan, etiqadın (inamın) ağıldan üstün olduğunu iddia edən dünyagörüşü və elmi dinə tabe etməyə, elmi biliklərdən dini ehkamların müdafiəsində istifadə etməyə çalışan mürtəce təlim. *Fideizm müasir fəlsəfənin və ilahiyyatın ideya ittifaqının əsasıdır.*

**FİDYƏ** *is.* [*ər.*] *köhn.* Girov tutulmuş, yaxud əsir alınmış bir adamı azad etmək üçün verilən pul və s.

**FİKİR** *is.* [*ər.*] 1. Düşünmə, düşüncə, təfəkkür; təfəkkür prosesi.

2. Niyyət, məqsəd, məram. *Fikrini başa düşmək. Fikrini anlatmaq. Getmək fikrindən daşınmaq.* – [Süleyman:] *Yaxşı, xala, bəs sənin fikrin?* Ü.Hacıbəyov. *Qızın fikrində bunların heç biri yox idi.* Mir Cəlal.

3. Fikirləşmə, düşünmə, mühakimə nəticəsində hasil olan qənaət, ideya. *Dərin fikir. Maraqlı fikir. Ciddi fikir. Boş fikir. Ağlıma belə fikir gəldi.* – [Sərvər:] *Doğru deyirsən, mən dünəndən bəridir ki, fikirdəyəm.* Ü.Hacıbəyov.

4. Rəy, görüş, mülahizə. *Nə fikriniz var? Bu barədə fikrin nədir?* – [İkinci fəhlə:] *Gedək görək camaatın fikri nədir?* H.Nəzərli.

[Qoşqar:] *Soyuqqanlı fikir mübadiləsi olmayan yerdə heç vaxt ümumi işə xeyir dəyməz, yoldaş Əmirli!* İ.Hüseynov.

5. Bilik. *Elmi fikir. Bədii fikir.*

6. Adamın ağlını məşğul edən şey, daim düşünülən şey (bəzən "**fikir-zikir**" şəklində işlənir). *Öz fikirləri ilə məşğul olmaq. Fikrindən ayrıla bilməmək. Fikri özgə yerdədir. Başında ancaq bir fikir var: – Uçmaq! Uşağın fikri oynamaqda qalıb. – Mirzə Cəmilin dedikləri Ataşın başına girmirdi, çünki bütün fikri-zikri Qönçənin yanında qalmışdı.* Ə.Vəliyev. *Cəmilə Manafovanın isə fikri-zikri kitabdır.* H.Seyidbəyli.

7. Hafizə qüvvəsi, yaddaş, xatır. *Fikrimdə qalmadı. Fikrindən çıxmaq. Fikrində saxlamaq.*

8. Əqidə, görüş, baxış. *Fikrinlə razı deyiləm.* – [Vəzir:] *Mən də o fikirdəyəm.* Ü.Hacıbəyov.

9. **Fikrimcə, fikrincə, fikrimizcə, fikrinizcə** və s. şəkillərdə – məncə, mənə görə; səncə, sənə görə; bizcə, bizə görə; sizcə, sizə görə. *Sonanın fikrincə, Bahar hər incə mətləbi gözdən oxuyan bir qızdı.* B.Bayramov.

◊ **Fikir aparmaq (götürmək)** – 1) bir şey, hadisə haqqında fikir etmək, fikirləşmək, fikrə getmək, fikrə dalmaq, düşünmək. *Fikir məni apardı, heykəl kimi dayandım.* M.Rahim. *Qız danışdıqca məni fikir aparırdı.* M.İbrahimov; 2) təşvişə düşmək. **Fikir çəkmək** – 1) dərd çəkmək, ruhən iztirab çəkmək, narahat olmaq. [Gültəkin Aydına:] *Paltar da istəmirəm, təki sən fikir çəkməyəsən, nə eləyirəm paltarı?* C.Cabbarlı; 2) gələcəyi haqqında fikirləşmək, taleyini düşünmək. **Fikir dəryasına qərq olmaq** – çox dərin fikrə getmək, fikrə dalmaq. **Fikir eləmək (etmək)** – 1) fikirləşmək, düşünmək. [Mozalanbəy:] *Bu gecə dürüst fikir elə, peşman olmazsan.* Ə.Haqverdiyev; 2) bir şeyin fikrini çəkmək, bir şeyin dərdinə qalmaq. *Çox fikir eləmə...* – [Gülnisə Bəhrama:] *Vallah, öz qızımçın nə qədər fikir edirəmsə, sənin üçün də o qədər fikir edirəm.* C.Cabbarlı. **Fikir götürmək** – fikrini məşğul etmək, fikrə qərq olmaq, təşvişə, narahatlığa səbəb olmaq. *Ənuşirəvanı fikir götürdü, çünki onun heç övladı olmayırdı.* (Nağıl). **Fikir vermək** – fikrinə qalmaq, diqqət vermək, diqqət yetirmək, qayğı göstərmək, qeydinə qalmaq. *Ekskavatorçular .. çox qazmağa çalışmaqla bərabər, yanacağa qənaət etməyə də xüsusi fikir verirdilər.* Ə.Sadıq. [Həsrət Hümmətə:] *İndi camaatın yaşayışına fikir vermək lazımdır.* B.Bayramov. **Fikir verməmək** – əhəmiyyət verməmək, qulaqardına vurmaq, etinasızlıq göstərmək. *O, deyilənlərə fikir vermir. – Bəy arvadın yalvarışına fikir vermədi.* Ə.Abasov. **Fikir yürütmək** – bir şey haqqında fikir irəli sürmək, fikir söyləmək, yeni söz demək. **Fikrə dalmaq** – b a x **fikrə getmək.** [İsmət:] *Keçən gecə bir xeyli fikrə daldım; Düşündüm, düşündüm, uyqusuz qaldım.* H.Cavid. *Şəkərəli böyük bir fikrə dalaraq irəliləyir və sürüdən dala qalan qoyunların qılcalarına əlindəki ağacını endirirdi.* T.Ş.Simurq. **Fikrə düşmək** – bir iş görmək qərarına gəlmək, niyyətində olmaq. [Abbas:] *Sizin fikriniz başqadır, elə fikrə düşməyin.* "Abbas və Gülgəz". [Müəllimin] *qarşısını alan, hətta başqa fikirlərə düşməsinə yol verməyən ancaq Telliyə qarşı bəslədiyi hörməti, səmimi bir məhəbbəti idi.* S.Hüseyn. **Fikrə getmək** – fikirləşmək, düşünmək. *Bir an fikrə getdikdən sonra* [yolçu] *yenə qaranlığı yarıb irəli getməyə başladı.* Ə.Məmmədxanlı. **Fikrə gəlmək** – qərara gəlmək, qət etmək. [Məsmə:] *Mən qəti bir fikrə gəldim.* S.Hüseyn. **Fikrə qərq olmaq** – b a x **fikir dəryasına qərq olmaq**. *Bu halda Zeyd ki o da Leylaya aşiqdir, xəyal və fikrə qərq olmuş bir surətdə zahir olub deyir..* Ü.Hacıbəyov. **Fikrə salmaq** – fikirləşməyə, fikrə getməyə, düşünməyə məcbur etmək. *Rüstəm bəy Məcidi nəzərdən keçirdi, onun sadəlövh siması və axmaq sözləri Rüstəm bəyi bir az fikrə saldı.* Çəmənzəminli. **Fikri dəyişmək** – əvvəlki fikrindən əl çəkib ayrı fikrə düşmək, rəyini dəyişmək. *Bir il o dağılmışda qalıb var-yoxu qandı; Az vəqtdə fikri dəyişib, rəyi dolandı.* Ə.Nəzmi. **Fikri dolanmaq** – b a x **fikri çaşmaq.** [Sərvinaz Əsədə:] *Ağlına gələn dağa-daşa, ay kişi, yenə fikrin*

*niyə dolanıb?* B.Bayramov. **Fikri özündə olmamaq** – dalğın, fikri dağınıq halda olmaq. **Fikrində durmaq** – b a x **fikrinin üstündə durmaq**. *Kazım .. yenə fikrində durub dedi..* Mir Cəlal. **Fikrində (fikrinə) qoymaq** – qərara gəlmək, qərarlaşdırmaq. [Qurbani] *fikrində qoymuşdu ki, gedib qonşunun həyətində gizlənsin..* "Qurbani". *Molla fikrinə qoyur ki, sövdəgərə bir-iki şirin söz desin.* "M.N.lətif." **Fikrindən daşındırmaq** – fikrindən əl çəkməyə məcbur etmək, fikrini dəyişdirmək. [Əbülhəsən bəy:] *O səsin qüvvəti .. məni qayıdıb getmək fikrindən daşındırdı.* M.S.Ordubadi. **Fikrindən daşınmaq** – fikrindən əl çəkmək, niyyətindən, istədiyi şeydən vaz keçmək, fikrini dəyişmək. *Qoca kişi .. qapını açıb içəri girmək, palaz atıb taxtın üstündə uzanmaq fikrindən daşındı.* İ.Şıxlı. **Fikrindən dönmək** – fikrindən əl çəkmək, fikrindən qaçmaq, dəbbələmək. *Zəfər fikrimdən dönə biləcəyimi görüb qəribə bir çeviklikIə məndən aralandı.* M.Hüseyn. **Fikrindən keçirmək** – xəyalən yadına salmaq, xəyalından keçirmək, təsəvvürünə gətirmək. *Düşündü yazıqlar gələn boranı; Keçirtdi fikrindən dağı, aranı.* H.K.Sanılı. *İdris bütün bunları bir anda fikrindən keçirirkən alman tankı artıq komanda məntəqəsinə yaxınlaşmışdı.* Ə.Məmmədxanlı. **Fikrindən keçmək** – 1) xəyalından keçmək, xəyalən yada salmaq, arzulamaq. *Göy üzündə görür-görməz hilalı; Keçər fikrimdən yarın xəyalı.* H.Cavid; 2) fikrən bir şeyi arzulamaq, ürəyindən keçmək. *Aşıq Ələsgərin fikrindən keçdi ki, bu gözələ bir tərif desin.* "Aşıq Ələsgər". **Fikrinə düşmək** – bir iş görmək qərarına gəlmək. *Kişi qonaqlıq fikrinə düşdü.* Mir Cəlal. **Fikrinə gəlmək** – 1) ağlına gəlmək, təsəvvürünə, xəyalına gəlmək. *Fikrinə min cür şeylər gəlir;* 2) qərara gəlmək. *İslamın fikrinə gəlmişdi ki, yuxarı kəndə getsin.* S.Hüseyn. **Fikrinə (fikrimə) gətirmək** – təsəvvürünə gətirmək, təsəvvür etmək, mümkün hesab etmək. *Belə bir növ fikrimə gətirə bilərəm ki, məsələn, 100, 200, 500 adam bir yerdə necə otururlar?..* H.Nəzərli. **Fikrini açmaq** – fikrində olanları açıb söyləmək, niyyətini bildirmək, ürəyini açmaq. *Telefonda fikrimi açarkən sənə; Həsrətlə baxdığım üzün də bəlkə; Uzaqdan-uzağa görünər mənə.* M.Müşfiq. **Fikrini azdırmaq** – azdırmaq, karıxdırmaq. *Mən yolumu azmadım; Mənə "Az!" deyənlərin; Fikrini azdırmışam.* B.Vahabzadə. **Fikrini çəkmək** – 1) qayğısına qalmaq, qeydinə qalmaq, haqqında düşünmək. [Bəhram Pəriyə:] *Əlbət ki, ana öz övladının fikrini hamıdan artıq çəkir.* C.Cabbarlı. [Gülzar Bəhruza:] [Atan və Fərhad] *da sənin fikrini çəkirlər, bala.* Ə.Məmmədxanlı; 2) narahat olmaq (bir adam haqqında). **Fikrini dağıtmaq** – 1) dərdini, kədərini dağıtmaq, kefini açmaq, şənləndirmək, pis fikirlərdən uzaqlaşdırmaq. *Qızlar Pərinin fikrini dağıtmaq üçün çalıb-oynadılar..* "Abbas və Gülgəz"; 2) fikirləşməsinə, fikrini toplamasına mane olmaq, fikrini bir yerə yığmağa qoymamaq, fikrini yayındırmaq. *Səs-küy adamın fikrini dağıdır.* **Fikrini dəyişmək** – b a x **fikri dəyişmək.** *İzzət qarı obaya yaxınlaşıb dincini almaq istədisə də, lakin üfüqdə qızartı işarəsi görüb fikrini dəyişdi..* Ə.Məmmədxanlı. **Fikrini yayındırmaq** – qəsdən birinin diqqətini başqa şeyə cəlb etmək. *Cavahirin fikrini yayındırmaq .. üçün Ləman böyük fədakarlıq göstərir.* H.Seyidbəyli. **Fikrinin üstündə durmaq** – öz dediyində israr etmək, sözünün üstündə durmaq, fikrindən dönməmək. [Nəsir] *hələ bəzi vaxt öz fikrinin üstündə duraraq böyük qardaşı ilə mübahisəyə də girişirdi.* S.Hüseyn.

**FİKİR-XƏYAL** *is.* [*ər.*] b a x **fikir.** [Ataş Mürsələ:] *Mən qorxuram, biz tətili qurtarandan sonra da sən fikir-xəyaldan aralanmayasan.* Ə.Vəliyev. *Ümid başını aşağı salıb fikir-xəyalı ilə əlləşirdi.* B.Bayramov.

**FİKİRLƏŞMƏ** "Fikirləşmək"dən *f.is.*

**FİKİRLƏŞMƏK** *f.* 1. Bir şey və ya iş haqqında düşünmək, götür-qoy etmək, ölçüb-biçmək. *Bir qədər fikirləş, sonra cavab ver. Bu barədə yaxşı fikirləşmək lazımdır. – Əhməd tacirbaşı bir az fikirləşdi, o, necə deyərlər, ölçdü-biçdi, götürdü-qoydu, axırda razı*

*olub tədarük görməyə başladı.* "Koroğlu". [Teymur:] *Mən bu əməliyyat haqqında çox fikirləşmişəm.* H.Seyidbəyli. // Fikrə getmək, düşüncəyə dalmaq. *Məsələnin həlli üzərində fikirləşmək.* – [Zeynal] *öz qapısının önündə durub fikirləşməyə başladı.* S.Hüseyn.

2. Fikrində tutmaq, niyyətində olmaq, düşünmək, bir şey etməyə hazırlaşmaq. *Toydan bir neçə gün sonra ortancıl bacı fikirləşdi ki, durum gedim, görüm bacım necədi.* (Nağıl). *Molla fikirləşir ki, bir eşşək yükü xiyar götürüb Teymurləngə aparsın.* "M.N.lətif.".

3. Qayğısına qalmaq, halını düşünmək, yaddan çıxarmamaq, tədbir aramaq. *Öz oğlunun gələcəyini fikirləşmək. Gənclik haqqında fikirləşmək.*

**FİKİRLİ** *sif.* Fikri bir şeylə məşğul, fikrə dalmış; dalğın. *Fikirli adam. Niyə belə fikirlisən? O, gözümə çox fikirli görünür.* – [Humay] *susdu, üzü yenə də fikirli və tutqun bir ifadə aldı.* İ.Əfəndiyev. // *zərf* Fikirli halda, fikirli-fikirli, dalğın halda, dalğın-dalğın. [Xasay] *bir müddət fikirli gəzdi.* Ə.Vəliyev.

**FİKİRLİLİK** *is.* Fikirli adamın halı, fikirli olma; dalğınlıq. *Gəmidən çıxaraq sahildə dayandıqları beş-on dəqiqə ərzində əsgərlərin açılan çöhrələrində nə isə bir tutqunluq, qeyri-müəyyən bir fikirlilik vardı.* Ə.Əbülhəsən.

**FİKİRSİZ** *sif.* Heç bir fikri, dərdi, qayğısı olmayan. *Fikirsiz adam.* // Fikri özündə olmayan; huşsuz. // *zərf mənasında.* Fikirləşmədən, düşünmədən, mülahizə etmədən. *Fikirsiz hərəkət etmək.* – [Şərəfoğlu Rüstəmə:] *Ən yaramaz cəhət isə budur ki, işin çox hissəsini fikirsiz, elmi mühakiməsiz görmüşsünüz.* M.İbrahimov.

**FİKİRSİZLİK** *is.* 1. Fikri özündə olmama; huşsuzluq. // Fikirsizcəsinə hərəkət, düşüncəsizlik.

2. Heç bir fikri, qayğısı, dərdi olmama.

**FİKRƏN** *zərf* [*ər.*] 1. Fikirləşərək, fikirlə, fikrində, zehnində düşünərək. *Fikrən bir şey düşünüb demək.* – [Firidun] *Şəmsiyyənin məqsədini fikrən müəyyən etməyə çalışdı.* M.İbrahimov.

2. Beyin, zehin cəhətdən. [Surxay Aydına:] *Sən fikrən və ruhən istirahətə möhtacsan.* C.Cabbarlı.

**FİKRİ** *sif.* [*ər.*] Fikrə, ağla, düşüncəyə aid olan, fikir, ağıl, düşüncə ilə bağlı olan; əqli, zehni. *C.Məmmədquluzadə fikri durğunluq, gerilik, cəhalət tüstüsünün xalq üçün yaratdığı qorxudan həyəcanla danışaraq əlac etməyə çağırırdı.* M.İbrahimov.

**FİKRİAÇIQ** bax **açıqfikirli.** *Fikriaçıq adam.* – [Zeynal] *özünü fikriaçıq, ziyalı bir şəxs hesab edərdi.* S.Hüseyn.

**FİKSÁJ** [*fr.* fixoge – möhkəm] Aydınlaşdırıldıqdan sonra fotoplyonkanı, fotoplastinkanı (neqativi) və ya onlardan kağıza çıxarılmış surətləri yuyub sabitləşdirmək üçün kimyəvi məhlul.

**FİKSAJLAMA** "Fiksajlamaq"dan *f.is. Neqativləri fiksajlama prosesi.*

**FİKSAJLAMAQ** *f.* Fotoplyonkanın surətlərini fiksajla işləmək. *Plyonkanı fiksajlamaq.*

**FÍKUS** [*lat.*] *bot.* Tutkimilər fəsiləsindən tropik ağac və ya sarmaşıq. // Həmin cinsə daxil olan, iri ovalşəkilli yarpaqları olan bəzək bitkisi.

**FİQÚR** [*lat.* figura – görünüş] 1. Bir iş görərkən (rəqs edərkən, təyyarədə uçarkən və s.) birinin və ya bir şeyin aldığı vəziyyət. *Rəqsin ayrı-ayrı fiqurları. – Təyyarəçi çox vaxt yüksək pilotaj fiqurları göstərməli olur ki, bu zaman insanın bədəni xeyli gərgin vəziyyət alır.* "Təyyarəçi".

2. Musiqi əsərini mürəkkəbləşdirən, gözəlləşdirən ritmik-melodik element.

3. Rəssamlıqda, heykəltəraşlıqda insan və ya heyvan təsviri. "*İdmançı qız*" *fiquru. – Hovuzdakı fiqurların müxtəlif əzalarından fışqıran fəvvarələr Bağdad gündüzünə məxsus hərarətin müqavimətini qıraraq, həyati bahar nəsimi ilə bərabər gələn şəbnəmlərlə doldururdu.* M.S.Ordubadi. // *teatr.* Surət, tip, xarakter.

4. Düzgün, qəşəng bədən quruluşu; qədd-qamət, boy-buxun. *Qızın gözəl fiquru var.* // Ümumiyyətlə, bədən. *Bezdən bir adam fiquru tikib içinə həşəm doldurardılar.* H.Sarabski.

5. Ən böyük oyun kartının (tuz, qoca, qız, oğlan) adı.

6. Şahmat oyununda: piyadadan fərqli olaraq şah, vəzir, top, fil, at. *İki fiqur və üç piyada. Bir fiquru iki piyadaya dəyişmək.*

7. *riyaz.* Müstəvinin qapalı xətlə məhdudlaşmış hissəsi; habelə müəyyən qaydada düzülmüş nöqtələrin, xətlərin, səth və cisimlərin hamısı bir yerdə. *Burada çoxlu həndəsi fiqurlar, riyazi sxemlər və formullar vardır.*

**FİQURÍST** [*lat.*] Mürəkkəb fiqurlar göstərən idmançı (əsasən konkisürən) (b a x **fiqur** 1-ci mənada). *Fiquristlərin yarışı.*

**FİQURLU** *sif.* 1. Kənarları, dövrəsi düzxətli olmayan, qırçın, mürəkkəb formada olan. *Fiqurlu peçenye. Bəzəkli fiqurlu ayaqları olan pardaqlanmış yemək stolu.* // Üzərində basma, naxış olan; naxışlı. *Fiqurlu kitab cildi.*

2. Fiqurla ifa olunan (b a x **fiqur** 1-ci mənada). *Fiqurlu rəqs. Fiqurlu konkisürmə.* ☐ **Fiqurlu üzmə** *idm.* – suda qrup halında icra edilən gimnastik hərəkətlər. *Fiqurlu üzmə yarışı.*

3. Şahmat oyununda: böyük fiqurlar vasitəsilə icra olunan. *Şah cinahına fiqurlu hücum.*

**FİL** *is.* [*fars.*] 1. *zool.* Tropik meşələrdə yaşayan uzun və qüvvətli xortumlu, tüksüz, otyeyən məməli iri heyvan. *Filin bir fikri var, filbanın min.* (Ata. sözü).

2. Diaqonal üzrə istənilən xanaya hərəkət edən şahmat fiquru. *Zəki Gülşənin necə oynayacağını əvvəldən bilirmiş kimi fili irəli itələdi.* M.Süleymanov.

◊ **Fil azarı** – bədənin ayrı-ayrı üzvlərinin (çox vaxt ayaqların) həcminin həddən artıq böyüməsindən ibarət xəstəlik. **Fil qulağında yatmaq** – heç bir şeylə maraqlanmamaq, heç bir şeydən xəbəri olmamaq. [Fizzə xanım Vahidova:] *Fil qulağında yatmışıq, ay Əli...* Ə.Məmmədxanlı. [Kolxozçu yoldaşına:] *Elə bil sən də fil qulağında yatmısan, ay zalım oğlu, heç şeydən xəbərin yoxdur.* B.Bayramov.

**FİLAN** *sif.* [*ər.*] Bir adamın, bir şeyin yaxud bir yerin adını çəkmək istəmədikdə onun əvəzinə işlədilən söz. *Filan adam. Filan kənd. Filan ev. – Bihudədir ol qamu fəsanə; Kim, aşiqdir filan filanə.* Füzuli. *Birdən eşidərdilər ki, Əbdülkərim filan kənddə filan adamın evində gizlənibdir.* Ə.Haqverdiyev.

◊ **Filan filan olmuş (şüdə)** *dan.* – söyüş məqamında işlədilən evfemistik ifadə. *Ədə, filan filan şüdə, sən cürət elədin, mənim arvadımın adını soruşdun?* C.Məmmədquluzadə. *Deməzlərmi, ay filan filan olmuşun qızı, bir tikə uşağın şəhərlərdə, hacıların qapısında nə iti azmışdı?* Mir Cəlal.

**FİLANİ** *is.* [*ər.*] *köhn.* b a x **filankəs.** *Təkəllümə gəlib vəfalı dilbər; Soruşub: – Bəs neçin filani gəlməmiş?* Q.Zakir. *Qoyma külahın kəc, ay bəy, aldatma cahanı; Bəsdir, a filani!* M.Ə.Sabir.

**FİLANKƏS** *is.* [*ər.* filan və *fars.* kəs] Adı deyilmək istənilməyən şəxs; filan adam. *Adını deməręm, eldən ayıbdır; Filankəsin qızı filan oynasın.* M.V.Vidadi. *İstəyirdi ki, ona indi sadəcə Ağca yox, filankəsin arvadı desinlər.* Mir Cəlal.

**FİLANTRÓPİYA** *is.* [*yun.*] Xeyriyyəçilik, yoxsullara kömək.

**FİLARMÓNİYA** [*yun.* phileo – sevirəm və harmonia – ahəng] Konsertlər təşkil edən və musiqi sənətini təbliğ edən cəmiyyət və ya idarə. *M.Maqomayev adına Azərbaycan Dövlət Filarmoniyası 1936-cı ildə təşkil olunmuşdur.*

**FİLATELÍST** [*yun.* phileo və felos] Filatelizmlə məşğul olan adam, marka kolleksioneri. *Filatelistlər cəmiyyəti. Filatelistlər klubu. Gənc filatelist.*

**FİLATELİYA, FİLATELÍZM** [*yun.* phileo – sevirəm və felos – yığım, rüsum] Kolleksiya üçün marka və poçt ödənişi nişanlarından yığıb saxlama.

**FİLBAN** *is.* [*fars.*] Fillərə baxan, xidmət edən; fil gəzdirən. *Xalqa göstərməyə fili filban; Küçədə gəzdirir idi hər yan.* A.Səhhət.

**FİLDEKÓS** [*fr.* fil d`Eosse – şotland sapı] İpək sapa oxşayan saya pambıq iplik (trikotaj toxumaq üçün işlədilir). // Həmin iplikdən toxunmuş. *Fildekos corab.*

**FİLDEPÉRS** [*fr.* fil de Pers – fars sapı] Əla fildekos. // Həmin sapdan toxunmuş. *Fildepers corab.*

**FİLİÁL** [*lat.* filialis – oğula məxsus] Hər hansı təşkilatın (idarənin, müəssisənin və s.) müəyyən dərəcədə müstəqilliyə malik şöbəsi. *İnstitutun filialı. Muzeyin filialı. Filialın rəhbəri. – Elmlər Akademiyasının filialının kağızı lazım idi.* M.İbrahimov.

**FİLİZ** *is.* Tərkibində metal və ya onun birləşmələri olan təbii xam mineral; külçə. *Dəmir filizi. Mis filizi. Dəmir, polimetal, mis və s.-nin filizləri daha geniş yayılmışdır.*

**FİLİZLİ** *sif.* Filiz yataqları olan, filiz çıxarılan. *Filizli sahələr.* // Tərkibində filiz olan. *Filizli qazıntılar. Filizli torpaq.*

**FİLİZSAFLAŞDIRMA** *is.* Tərkibində filiz olan xam mineralların ilk emalı. *Filizsaflaşdırma kombinatı.*

**FİLİZYUYAN** *sif. xüs.* Filizi su ilə yuyub təmizləyən. *Filizyuyan qurğu.*

**FİLM** [*ing.*] Kinofilm, kinoşəkil, kinolent. "*Dədə Qorqud*" *filmi. Uşaqlar üçün film. – Çay-çörəkdən sonra hamısı dəstə ilə yeni filmə baxmağa getdi.* M.Hüseyn. [Murad:] *Deyirlər, sabah yaxşı film göstəriləcək..* İ.Əfəndiyev.

**FİLMOSKÓP** [*ing.* film və *yun.* skopeo – baxıram] Pozitiv kinoplyonkaları göstərmək üçün proyeksiya aparatı.

**FİLMOTÉKA** [*ing.* film və *yun.* theke – yeşik] Kinostudiyada, kitabxanada və ya kinofabrikdə kinofilmlərin yığılıb saxlandığı şöbə, arxiv. *Filmotekada saxlanılan kino əsərləri elmi cəhətdən öyrənilir.*

**FİLOLÓGİYA** [*yun.* phileo – sevirəm və logos – söz] Hər hansı bir xalqın dil və ədəbiyyatını öyrənən elmlərin hamısının birlikdə adı. *Azərbaycan filologiyası. Antik filologiya. Şərq filologiyası. Antik dövr abidələrinin öyrənilməsi ilə filologiyanın sərhədləri genişləndi.*

**FİLOLOJİ́** *sif.* Filologiyaya aid olan, filologiya ilə əlaqədar olan. *Filoloji təhsil. Filoloji tədqiqat. Filoloji əsər.* // Filologiya üsullarına əsaslanan. *Əlyazmasının filoloji təhlili.*

**FİLÓLOQ** [*yun.*] Filologiya mütəxəssisi. *Gənc filoloqların araşdırmaları.*

**FİLÓSOF** [*yun.* phileo – sevirəm və sophia – müdriklik] 1. Fəlsəfə mütəxəssisi, ümumiyyətlə, fəlsəfə ilə məşğul olan, dünyagörüşü məsələlərini tədqiq edən alim, mütəfəkkir. *Görkəmli Azərbaycan filosofu Bəhmənyar. Şair Füzuli həm də filosofdur. – Kainatda hər şey cəzbə bağlıdır; Filosoflar bunu eşq adlandırır.* N.Gəncəvidən.

2. *məc.* Həyata, hadisələrə ağılla, düşüncə ilə, mühakimə ilə yanaşan, həyatda qarşıya çıxan çətinliklərə, iztirablara soyuqqanlılıqla dözən adam.

**FİLOSOFANƏ** *sif.* [*yun.* philosof və *fars.* ...anə] 1. Filosof kimi (b a x **filosof** 2-ci mənada). *Həyata filosofanə* (z.) *baxmaq.* // Dərin fikrə dalmış kimi görünən. *Rüstəm bəyin filosofanə siması birdən-birə dəyişildi, dodaqlarında səmimi və təmiz bir təbəssüm oynamağa başladı.* Çəmənzəminli.

2. B a x **fəlsəfi**. [Qətibə Nizamiyə:] *Bütün şad və məsrur dəqiqələrimi sizi xatırlamaq və sizin filosofanə əsərlərinizi oxumaqla keçirmişəm.* M.S.Ordubadi.

**FİLOSOFLUQ** *is.* Fəlsəfi mühakimələrə meyil, mücərrəd mühakimələrlə məşğul olma. // *məc.* Əllaməlik, üqəlalıq. [Yəhya:] *Filosofluq sənə heç yaraşmır, Əli.* Y.Əzimzadə. □ **Filosofluq etmək** – əllaməlik etmək. *Telli arvad* [Rüstəm kişiyə] *baxanda filosofluq edib deyirdi..* M.İbrahimov.

**FİLTR** [*fr.*] Mayeni içində olan bərk cisimlərdən ayırmaq üçün cihaz və ya məsaməli cisim; süzgəc.

**FİLTRÁT** [*fr.*] Filtrdən (süzgəcdən) keçirilmiş maye.

**FİN** Finlandiyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Fin professional musiqi mədəniyyəti.*

◊ **Fin bıçağı** – qında gəzdirilən qısa yoğun tiyəli bıçaq; finka.

**FİNÁL** [*ital.* finale – sonuncu, axırıncı] 1. *inc.* Musiqi, teatr və ya ədəbi əsərin sonu. *Simfoniyanın finalı. Romanın finalı. –* "*Koroğlu*" *uvertürası operanın finalında səslənən təntənəli və möhtəşəm musiqi ilə qurtarır.* Ə.Bədəlbəyli.

2. *idm.* İdman yarışlarının qalibi müəyyən edən son hissəsi. *Finala çıxmaq. Finalda oynamaq. Finalda qalib gəlmək.*

**FİNALÇI** *is. idm.* Final oyununda, yarışında iştirak edən idmançı və ya idman komandası. *Finalçıların yarışı* (*görüşü*). *Finalçı idmançı.*

**FİNCAN** *is.* Çay, qəhvə, su və s. içmək üçün kiçik, dairəvi, əsasən dəstəli, saxsı və ya çini qab. *Qəhvə fincanı. Fincana şərbət*

*tökmək. Çini fincan. – Piri kişi .. çaydandan iki fincan çay töküb süfrəyə qoydu.* S.S.Axundov. *Nizamla əyləşdilər; Bir fincan çay içdilər.* B.Vahabzadə. ◻ **Fincan kimi** – iri və parlaq (göz haqqında).

**FİNCƏ** *sif.* və *zərf* Fin dilində. *Fincə danışmaq. Fincə-rusca lüğət. Fincə öyrənmək.*

**FİNİŞ** [*ing.* finisch – son] 1. Sürət idman yarışlarının həlledici son hissəsi. *Qaçışın finişi.*

2. Belə yarışlarda distansiyanın son nöqtəsi. *Finişə birinci çatmaq.* // Məc. mənada. *Sənsiz olacağam deməyə gəlmir dilim; Kim bilir, hardadır; ömür yolunun finişi.* R.Rza.

**FİNKA** [*rus.*] bax **fin bıçağı** ("**fin**"də).

**FİN-UQOR: Fin-uqor dilləri** *dilç.* – başlıca olaraq Mərkəzi və Şərqi Avropada və Asiyanın şimal-qərbində yaşayan xalqların (macarların, finlərin, karellərin, estonların, xantların, mansilərin, saamların, komilərin və bəzi başqa xalqların) danışdığı dil qrupu; uqor-fin dilləri. *Fin-uqor dilləri Ural dillərinin iki qolundan biridir.*

**FİRAVAN** *sif.* və *zərf* [*fars.*] Çox, bol, çoxlu, varlı. *Firavan həyat. Firavan dolanacaq. – Uşaqlığında ata-ananın nəvazişindən başqa heç nə görməyən Səltənət ərə gedəndən sonra çox firavan yaşamışdı.* Ə.Vəliyev. *Daha da firavan, xoşbəxt görürəm; Bizim hər şəhəri, hər kəndi bu gün.* O.Sarıvəlli.

**FİRAVANLIQ** *is.* Yaşayış üçün hər cür maddi nemətlərin bol olduğu hal; bolluq, rifah. *Firavanlıq içində yaşamaq. – Adamların şərəfli əməyi ilbəil ölkəmizə bolluq, xalqımıza firavanlıq gətirəcəkdir.*

**FİRƏNG** *is.* Danışıq dilində "fransız" mənasında işlədilir. [Şahbaz bəy:] *Şərəfnisəyə firəng qızları başlarına örtən təsəklərdən alıb sovqat gətirrəm də.* M.F.Axundzadə. *Öz dilindən də gözəl; Bilir firəng dilini.* B.Vahabzadə.

**FİRƏNGTOYUĞU** *is. zool.* Toyuq fəsiləsinə mənsub quş.

**FİRƏNGÜZÜMÜ** *is. bot.* 1. Tikanlı giləmeyvəli kol.

2. Həmin kolun göy rəngli turşaşirin meyvəsi. *Firəngüzümü mürəbbəsi.*

**FİRƏNGCƏ** *sif.* və *zərf* Fransızca, fransız dilində. *Modabaz və meşşan qadınlardan bəhs edən ədib deyir ki, əlbəttə, belə anaların tərbiyə etdiyi uşaqlar tans öyrənəcəklər, firəngcə donquldanacaqlar.* M.Arif.

**FİRQƏ** *is.* [*ər.*] *köhn.* 1. Bax **partiya** 1-ci mənada. *Qəza firqə özəyinin qapısında dayanan keşikçilər Kəsəmənlini görən kimi gülümsünüb ona yol verdilər.* İ.Şıxlı. *Nədir bu partiya? Mən anlamıram; Firqə, dar çərçivə, firqə bir qəfəs!* B.Vahabzadə.

2. Camaat, tayfa. *Qalıbdır firqeyi-islam dalda cümlə millətdən; Əhatə eyləyiblər başqalar elm ilə dünyanı.* S.Ə.Şirvani. // Zümrə, ictimai təbəqə. *Gələcəkdəki məqaləmizdə Qasım bəy Zakirin rəiyyət tayfasına cövr və sitəm edən şair firqələrin barəsində yazdığı şeirlərdən danışıb əsil mətləbə keçəcəyik.* F.Köçərli.

**FİRQƏÇİ** *is. köhn.* Firqə üzvü; firqəli, partiyaçı. [Eldar:] *Firqəçi olduğu üçün mənim narazılığımdan çəkinir..* S.Hüseyn. [Çiçək:] *Kənddə cəmi iki-üç firqəçi vardı.* B.Bayramov.

**FİRQƏLİ** *köhn.* bax **firqəçi**.

**FİRQƏT** *is.* [*ər.*] Ayrılıq, fəraq. *Yoxumdu tabü təvan firqətə, cavan, getmə!* X.Natəvan. *Mehriban aşığım, hara gedirsən? Sənin bu firqətin kədərlidir çox.* M.Müşfiq.

**FİRMA** [*ital.*] Rəsmi hüquqa malik olub, markası ilə mal satılan və ya məmulat buraxılan ticarət və ya sənaye müəssisəsi. *Ticarət firması. Avtomobil firması. – İldən-ilə qüvvətlənən nəhəng firmaların yanında* [Əzimbəyov qardaşlarının korporasiyası] *ən adi bir emalatxanaya bənzəyirdi.* M.Hüseyn. ◻ **Firma mağazası** – ancaq bir firmanın istehsal etdiyi mallar satılan mağaza. *Mebel firma mağazası.*

**FİRNİ** *is.* Düyü unu və şəkərdən hazırlanan desert yeməyi. *Axşam azanı deyilən kimi, mömin müsəlman bilmir ki, nəyə əl uzatsın, çaymı içsin, firnimi yesin, halvadanmı dadsın.* C.Məmmədquluzadə. *Orucluq ayının özünəməxsus süfrəsi vardı: firni, tərək, balhalvası, nazik yuxa, şorqoğalı və sairə.* H.Sarabski.

**FİRÓN** *is.* [*ər.*] 1. Qədim Misir padşahlarına verilən ad. [Şeyda:] *Fironu qəhr edən*

*Musa bir çobandan başqa bir şey deyildi.* H.Cavid.

2. *məc.* Çox məğrur, kibrli, zülmkar adam haqqında. *Fironun biridir. // məc.* Qudurğan, harın. *Firon uşaq.*

**FİRONLUQ** *is.* Qudurğanlıq, kibrlilik, lovğalıq; azğınlıq, zülmkarlıq. □ **Fironluq etmək (eləmək)** – qudurğanlıq etmək, azğınlıq etmək, zülm etmək. [Cabbar:] *Ramazan, daha durmaq yeri deyil, bu zalımı gərək cəzasına çatdıraq, bu qədər fironluq elədi, bəsdir.* B.Talıblı. [Əbülhəsənov:] *Paşa bəyin fironluq elədiyi zaman Sevdim əmi dözürdü, indi nədənsə tələsir.* Ə.Vəliyev.

**FİRUZƏ** *is.* [*fars.*] 1. Göy rəngli qiymətli daş. *Firuzə yataqları. – Sarı dağın ətəyindəki yaşıl meşə altun üzərinə nəsb olunmuş firuzəni andırırdı.* Çəmənzəminli. // Həmin daşdan qaşı olan. *Firuzə qaşlı üzük.*

2. Göy, mavi. *Firuzə səma. – Mən görmüşəm kölgələri; Firuzə sulara düşən; Ağ yelkənlərin yaraşığını.* R.Rza. *Kainat nə böyük, yaşamaq nə xoş; Firuzə dəniz də bəxtiyar, sərxoş.* N.Rəfibəyli.

**FİRUZƏYİ** *sif.* [*fars.*] Firuzə rəngində olan; göy, mavi. *Firuzəyi rəng. Firuzəyi kaşı.*

**FİSİNCAN** *is.* Xırda küftələrlə döyülmüş qoz ləpəsi, abqora (və ya nar şirəsi), yağsoğan ilə bişirilən plov xuruşu. *Fisincan bişirmək. Plovun qarası fisincandır. – Qoz ləpəsi, yağlı fisincanı gör; Süfrəyə bax, neməti-əlvanı gör.* S.Ə.Şirvani. *Paxlava, bal, firni, fisincan iyi; Lap eləyir adəmi bican iyi.* Ə.Nəzmi.

**FİSİNCANPLOV** *is.* Xuruşu fisincandan ibarət olan plov. [Xortdan:] *Mirzə durub, gedib qapını açıb, oradan bir məcməyi fisincanplov gətirib qoydu ortalığa.* Ə.Haqverdiyev.

**FİSQ** *is.* [*ər.*] *klas.* Pis işlər, günah işlər; əxlaqa zidd iş; yavalıq, pislik. *Müridlərdə bütün bidəti, cinayəti, fisqi; Yalan hədisləri rövzəxanda görməli imiş.* M.Ə.Sabir.

**FİSQARMÓNİYA** [*alm.*] Orqan kimi səslənən klavişli (dilli) nəfəslə çalınan musiqi aləti.

**FİŞƏNG** *is.* 1. Alışarkən havada yüksəkliklərə qalxan, şənliklərdə, atəşfəşanlıqda, habelə siqnal verməkdə və hərbi işdə tətbiq edilən partlayıcı maddə, mərmi. *Qırmızı fişəng. – Bu halda sərayi-şahidən göyə bir fişəng buraxdılar.* M.F.Axundzadə. *Rəngarəng fişənglər hər tərəfi çıraqbana döndərmişdi.* M.Hüseyn.

2. *köhn.* Patron. *Tüfəngə fişəng qoymaq. – Boyunlarda yeksər qəşari-fişəng; Revolverlər əldə, həmayil tüfəng.* M.Ə.Sabir. *Uzunboylu, sarıbənizli, alagözlü tağım komandanı tağımı fişənglə təchiz edirdi.* H.Nəzərli.

**FİT** *is.* 1. Bir-birinə kiplənmiş dodaqların və ya dişlərin arasından güclü nəfəsvermə, yaxud fıştırıq və s. vasitəsilə çıxarılan kəskin zil səs. *Gecə yarıdan addamışdı. Vədə olunmuş fit səsi Gülsümün qulağına gəldi.* Ə.Haqverdiyev. *Həyətdə Cəfər əminin fiti və tənbəl-tənbəl atılan addımlarının səsi eşidilirdi.* H.Nəzərli. □ **Fit çalmaq** – bu üsulla ağızdan səs çıxarmaq. *Katib yenə heç bir şey eşitmirmiş kimi durub fit çaldı.* M.İbrahimov. // Bu cür səs çıxarmaq üçün alət; fıştırıq. // Mexaniki fıştırıqla çıxarılan sürəkli zil səs; siqnal. *Gəminin fiti. Parovozun fiti. Fit vermək. – Mədən fitləri səhər saat altını vurur.* M.İbrahimov. [Göyçək] *..sayıq yatmalı idi ki, qatarın fit səsini eşidəndə durub perrona çıxsın.* Ə.Əbülhəsən.

2. Bəzi quş və heyvanların çıxardığı eyni tembrli və tonlu səs; fışqırıq.

3. Vıyıltı, uğultu.

◊ **Fitə basmaq** – fit çalmaqla öz nifrətini, narazılığını, hiddətini bildirmək; fitləmək. *Tahir bir istədi qışqırsın, tülküsifət natiqi fitə bassın, ona öz yerini göstərsin, amma məclisdə oturanların töhmətindən çəkinib dinmədi.* M.Hüseyn.

**FİTƏ** *is.* [*ər.*] Hamamda çimərkən və ya bir iş görərkən belə bağlanılan qumaş parça (əsasən qırmızı rəngdə olur). *Camadar ustaya yanaşıb, onun quru fitəsini bucaqda dəyişib ona köhnə və yaş bir fitə verdi.* Çəmənzəminli. [Bir ayrısı:] *Paltarlarımızı tamam çıxardıb, adama bir fitə tutardıq, sonra on-on beş girvənkə gələn ağac milləri atıb-tutar, oynadardıq.* Çəmənzəminli. // Bəzi Şərq ölkələrində şalvar əvəzinə belə bağlanan qumaş parçası. *Efiopiya kəndlisinin fitəsi.*

**FİTİL** *is.* 1. B a x **piltə** 1-ci mənada. *Lampa fitili. – Arvad istər-istəməz maşınkaya sarı getdi. Fitilini düzəldib aşağı çəkdi.* S.Rəhman. *Tavandan asılmış çırağın fitilini qaldıran olmadığından, otaq güclə işıqlanırdı.* İ.Şıxlı. // Bir şeyi alışdırmaq, partlayış əmələ gətirmək üçün alışqan qaytan. *Daldan gəlir top, topxana, qumbara; Fitilləri tüstüləyir havadə.* A.Səhhət. *Bu iyrənc səltənəti darmadağın edəsi; Qəzəbinin coşması bənddir bircə fitilə; İradəndir o fitil.* X.Rza.

2. B a x **piltə** 2-ci mənada. *Yaraya fitil qoymaq. Yaranın fitilini çıxarmaq.*

**FİTİLLƏMƏ** "Fitilləmək"dən *f.is.*

**FİTİLLƏMƏK** *f.* 1. Partlayıcı şeylərin fitilini alışdırmaq.

2. *məc.* Qızışdırmaq, alışdırmaq.

**FİTİLLİ** *sif.* Fitili olan, fitil keçirilmiş. *Fitilli lampa.* // Fitillə alışdırılan. *Fitilli mina.*

**FİTLƏMƏ** "Fitləmək"dən *f.is.*

**FİTLƏMƏK** *f.* 1. Fit çalmaq, fit vermək; fitlə bildirmək, ya çağırmaq. *Qoyunları aparmaq üçün fitləmək.* – [Beyrək] *..ətirli payız ot və çiçəklərindən qırpan boz atı fitləyib çağırdı.* M.Rzaquluzadə.

2. B a x **fitə basmaq** ("**fit**"də).

3. *məc.* Təhrik etmək, sövq etmək, qızışdırmaq.

**FİTNƏ** *is.* [*ər.*] 1. Qarışıqlıq, ara pozma, ara qarışdırma; adamları, camaatı və s. bir-birilə vuruşdurmaq, aralarını pozmaq üçün gizlicə hazırlanan qəsd, xəyanət, fitnə-fəsad; provokasiya. *Sən ömründə fitnə toru qurmamısan; Min insanla bölüşmüsən qismətini.* S.Vurğun. [Salatın:] *Əgər onun fitnəsi olmasaydı, bibim nə müridlərin meyxanasına gedərdi, nə də başına bu iş gələrdi.* İ.Şıxlı. ☐ **Fitnə salmaq (törətmək)** – araya nifaq salmaq, ara qarışdırmaq, fəsad törətmək. *Paşa bəy Nəbinin yoldaşları arasına fitnə salır.* "Qaçaq Nəbi". // Fitnəçi. *Fitnə adamdır.*

2. *məc.* Qurğu, tələ, hiylə. [Vəzir:] *Kəs səsini, ay ləçər, məni dilə basdırma, dəxi mən səni tanıdım, bu qədər fitnə və feil tamam sənin işin imiş.* M.F.Axundzadə. *Səba xanım bütün macəra və fitnəni öz şəxsində mərkəzləşdirdiyinə baxmayaraq, onun zahiri gözəlliyi təbiətin möcüzələrindən idi.* M.S.Ordubadi.

**FİTNƏÇİ** *is.* və *sif.* Fitnə törədən, araqarışdıran, fitnə-fəsad salan, adamları bir-birilə vuruşduran, onların arasına təfriqə salan; provokator. // Məc. mənada. [Böyükxanım] *başı üstündən aynanı götürüb, fitnəçi gözlərini aynaya açıb baxırdı.* M.S.Ordubadi.

**FİTNƏ-FƏSAD** *is.* [*ər.*] b a x **fitnə** 1-ci mənada. *Araya fitnə-fəsad salmaq. – Biri də çolaq Məcid özüdür. Çox fitnə-fəsad sevən adamdır.* B.Talıblı. [Saray vəziri] *öz xeyri üçün məmləkətdə fitnə-fəsad qalmırdı ki, törətməsin.* M.İbrahimov.

**FİTNƏKAR** *is.* [*ər.* fitnə və *fars.* ...kar] b a x **fitnəçi**. *Fitnəkar adam. O, çox fitnəkarları ifşa etmişdi. – Hüsaməddinin fikirləri bir daha bu fitnəkar qadının* [Qətibənin] *gəncliyinə qayıtdı.* M.S.Ordubadi. *Dağ uçdu? Uçruldu? – Bilinmir bu sirr! Fitnəkar feilləri deyilsə, nəydi?* M.Araz.

**FİTNƏKARLIQ** *is.* Fitnə törətmə, araqarışdırma, fitnə-fəsad salma; provokasiya, provokatorluq. *Faşistlər yeni-yeni fırıldaqlara və fitnəkarlıqlara əl atırdılar.*

**FİTNƏLİ** 1. B a x **fitnəkar**.

2. *məc. sif.* Fitnəyə, fəsada bais olan, fitnə salan. *Həm söylə, nigar sağ, əsənmi; Ol fitnəli yar sağ, əsənmi?* Xətayi. *Heyvan kimi bir barədə palçıqda qalanda; Sal fitnəli söz ortalığa, hövsələtəng ol!* M.Ə.Sabir.

**fito** [*yun.* phyton – bitki] Mürəkkəb sözlərin "bitki" mənasında olan birinci tərkib hissəsi; məs.: fitopaleontologiya, fitocoğrafiya və s.

**FİTR** *is.* [*ər.*] Orucdan çıxma, qurtarma, orucu sona vurma.

**FİTRƏ** *is.* [*ər.*] *din.* İslamiyyətdə ailə üzvlərinin sayına görə orucluq ayında yoxsullara, yetimlərə verilməli olan sədəqə. [Odabaşı:] *Camaatın .. zəkatı və fitrəsi ağanın mübarək əlilə paylanardı.* Ə.Haqverdiyev.

**FİTRƏT** *is.* [*ər.*] 1. Yaradılış, xilqət, təbiət. *Bir rəngdə deyildir insan fitrəti; Quzuykən qəflətən o dönür şirə.* B.Vahabzadə.

2. Xasiyyət, təbiət. *Fitrəti belədir. Fitrətində olmaq.* – [Çopo Ceynizə:] *Deməli,*

*başqa-başqa fitrətə malik olduğumuzdan bir-birimizi anlaya bilməyəcəyik.* Çəmənzəminli. *"Nəzakət", "sakitlik", "mədənilik" naminə nöqsanların üstünü vurmamaq bizim .. fitrətimizə ziddir.* S.Rəhimov.

**FİTRƏ-ZƏKAT** *top.* [*ər.*] Fitrə və zəkat. *Sonra bu həyatin seyidləri bir müddət də fitrə-zəkatla dolandılar.* H.Seyidbəyli.

**FİTRİ** *sif.* [*ər.*] Xilqətində, təbiətində, yaradılışında olan; anadangəlmə. *Fitri bacarıq. Gənc xanəndənin parlaq fərdi yaradıcılıq üslubu, onun gözəl fitri qabiliyyəti hamının diqqətini cəlb etmişdi.* – [Əlyarovun] *fitri istedadını düşmənləri belə danmırdılar.* M.Hüseyn.

**FİTVA** *is.* [*ər.*] 1. *din.* Bir işi icra etmək üçün din başçısı və ya hökmdar tərəfindən verilən icazə, hökm. ☐ **Fitva almaq** – bir işi icra etmək üçün din başçısının, ya hökmdarın icazəsini almaq. [Padşah:] *Üləmanı cəm elə və onlardan fitva al.* Ə.Haqverdiyev. **Fitva vermək** – bir işi icra etmək üçün şərən icazə (hökm) vermək. *Bir gün fitva verdi axund minbərdən; Lənətlə çəkilsin Sabirin adı.* B.Vahabzadə.

2. *məc.* Ümumiyyətlə, icazə, razılıq. *Müqim bəy öz fitvasını danıb Mirzə Polad müəllimin qanını Ələmdarın .. boynuna yıxa bilər.* S.Rəhimov. ☐ **Fitva vermək** – icazə vermək, yol vermək. [Kəndli:] *..Yoldaş Veys, nahaq yerə bu işə fitva verirsiniz.* Ə.Əbülhəsən.

**FÍZİK** [*yun.*] Fizika mütəxəssisi. *Təbiət gözəldir və fiziklər özlərini bəlkə də bu gözəlliklər xatirinə uzun, ağır əziyyətlərə salırlar. – ..Hər halda fizikin də məqsədi təbiət hadisələrinin ahəngini açmaqdır.* X.Məmmədov.

**FÍZİKA** [*lat.* physike – təbiət] Təbiət hadisələrinin ümumi qanunauyğunluqlarını, materiyanın (maddə və sahənin) hərəkət qanunlarını, ümumi xassələrini və quruluşunu öyrənən elm. *Fizikanın əsas prinsipi. Fizikada mexanikanın tam hökmranlığı XIX əsrdə başa çatdı. Bütün inkişafı boyu fizika fəlsəfə ilə sıx bağlı olmuşdur. – ..Eynşteynin ömür yolunu yeni fizikanın tərcümeyi-halından necə ayırmaq olar?* X.Məmmədov.

**FİZİKÍ** *sif.* 1. Fizikaya aid olan. *Fiziki nəzəriyyə. Fiziki elmlərin müasir vəziyyəti.*

2. Fizikanın məşğul olduğu hadisələr sahəsinə aid olan. *Torpağın fiziki xassələri. Fiziki proseslər. Əsas fondların fiziki aşınması.*

3. İnsan orqanizminə aid olan; cismani. *Fiziki nöqsan.* // Bədən hissləri ilə bağlı olan. *Fiziki əzab.*

4. Əzələ, damar fəaliyyətinə aid olan; qeyri-zehni. *Fiziki məşqlər. Fiziki əmək. – Dərs hazırlamağa oturmamışdan əvvəl fiziki işlə məşğul olmaqdan İkramın xoşu gəlirdi.* Ə.Əbülhəsən. *..Qərib isə o dünyalıqdı, mənən saf və təmiz olan bu insanın fiziki qüvvəsi tükəndi.* İ.Məlikzadə.

◊ **Fiziki kimya** – kimyəvi hadisələri fiziki üsullar vasitəsilə öyrənən, fizika ilə kimyanı birləşdirən elm. **Fiziki coğrafiya** – Yerin səthini, iqlimini, bitki və heyvanat aləmini öyrənən elm. *Fiziki coğrafiyanın ümumi nəzəriyyəsinin inkişafı üçün Vernadskinin tədqiqatları böyük əhəmiyyətə malikdir.*

**FİZİOKRÁT** [*yun.* physia – təbiət və kratos – hakimiyyət] Torpaq və əkinçiliyin sərvətin yeganə mənbəyi, əkinçilik əməyinin isə yeganə istehsaledici əmək olduğunu iddia edən XVIII əsr burjua siyasi iqtisadi nəzəriyyəsi tərəfdarlarına verilən ad.

**FİZİOLÓGİYA** [*yun.* physia – təbiət və logos – elm] 1. Canlı orqanizmin və onun hissələrinin həyati vəzifələri və fəaliyyəti haqqında elm. *Bitkilərin fiziologiyası. Müqayisəli fiziologiya. Fiziologiya biologiyanın ən mühüm bölmələrindəndir.*

2. *məc.* Şəhvani hissiyyat.

◊ **Danışıq səslərinin fiziologiyası** – fonetikanın, danışıq cihazının quruluşunu və onun fəaliyyətini öyrənən bəhsi.

**FİZİOLOJÍ** *sif.* 1. Fiziologiyaya aid olan. *Fizioloji tədqiqat üsulları. Fizioloji məsələlər.*

2. Cismani, şəhvani. *Fizioloji hisslər.*

3. Canlı orqanizmləri öyrənən bir sıra fənlərin adlarının tərkibində işlənir. *Fizioloji akustika. Fizioloji optika. Fizioloji psixologiya.*

**FİZİÓLOQ** [*yun.* physia – təbiət və logos – elm] Fiziologiya mütəxəssisi.

**FİZİOTERAPÉVT** [*yun.* physia və therapentes] Fizioterapiya mütəxəssisi olan həkim.

**FİZİOTERAPEVTÍK** *sif.* Fizioterapiyaya aid olan, fizioterapiya ilə əlaqədar olan. *Fi-*

*zioterapevtik müalicə. Fizioterapevtik amillərin təsiri olduqca çoxsahəlidir.*

**FİZİOTERAPÍYA** [*lat.* physia – təbiət və therapentes – müalicə] Fiziki, təbii vasitələr (işıq, elektrik və s.) ilə müalicə. *Fizioterapiya və kurortologiyanın inkişafı.*

**FLAKÓN** *is.*[*fr.*] Ətir şüşəsi.

**FLÁQMAN** [*holl.*] Böyük hərbi gəmi birləşməsinin (eskadra, diviziya, dəstə) komandanı, habelə həmin gəmi birləşməsi komandanının olduğu gəmi. *Flaqman gəmisi.*

**FLANÉL** [*fr.*] Xovlu yumşaq pambıq və ya yun parça. // Həmin parçadan hazırlanmış və ya tikilmiş. *Flanel adyal. Flanel köynək.*

**FLÉKSİYA** [*lat.* flexio – əyilmə, keçmə] *dilç.* Hallandıqda, təsrif edildikdə, habelə cins şəkilçiləri qəbul etdikdə dəyişən söz sonluğu. *Sözlərin sonundakı şəkilçilərin dəyişməsi xarici fleksiya adlanır.* ☐ **Daxili fleksiya** *dilç.* – qrammatik formalar əmələ gətirmək üçün sözün kökündəki fonemlərin dəyişilməsi.

**FLEKTİV: flektiv dillər** *dilç.* – fleksiya (o cümlədən daxili fleksiya) vasitəsilə qrammatik formalar əmələ gətirən dillər. *Hind-Avropa, sami-hami dilləri flektiv dillərə aiddir.*

**FLEQMÁTİK** *is.* [*yun.* phlegma – selik] Hippokratın aşkar etdiyi dörd temperamentdən biri; soyuqqanlı, laqeyd, süst, key adam haqqında.

**FLEŞ** *is.* [*fr.*] *bot.* Çay kolunun təzə yarpağı.

**FLEYTA** *is.* [*alm.*] Nəfəslə çalınan musiqi aləti. *Yan fleyta. Şaquli fleyta. Fleytanın səsi aydın, şəffaf və güclüdür.*

**FLÍGEL** *is.* [*alm.*] Evin yanında əlavə tikili.

**FLÓRA** [qədim Roma əsatirində çiçək, yaz və gənclik ilahəsinin adından] Hər hansı bir yerin və ya geoloji dövrün bitki aləmi, bütün bitki növlərinin toplusu; nəbatat. *Azərbaycanın florası. Hər bir floranın əsasını onun növ və cins tərkibi təşkil edir.*

**FLORÍN** *is.* [*ital.*] İtaliyada pul vahidi.

**FOKSTRÓT** [*ing.*] Sürətlə oynanılan dördgedişli rəqs və həmin rəqsin musiqisi. *Fokstrot oynamaq. – Orkestrin çaldığı fokstrot gur səslə ətrafa yayılırdı.* M.Süleymanov.

**FÓKUS**[1] [*lat.* focus – mənbə] 1. *fiz.* Sınmış və ya əks etmiş şüaların kəsişdiyi nöqtə. *Hər optik sistemin iki fokusu olur.*

2. *fot.* Fotoda şəkli çəkilən obyektin aydın əksinin alındığı nöqtə. *Hər optik sistemin iki fokusu olur.*

3. *riyaz.* Əyri xətt üzərindəki xəyali nöqtəyə nisbətən xüsusi xassəyə malik olan sabit nöqtə. *Ellipsin fokusu.*

4. *məc.* Bir şeyin toplandığı yer; mərkəz, əsas mərkəz.

**FOKUS**[2] [*alm.* canlı dildə “foks”] bax **gözbağlıca.** *Teatrda pərdə açılmayınca mən bu əqidədə idim ki, fokus göstərəcəklər.* Ə.Haqverdiyev. // *məc.* Hoqqa, hoqqabazlıq, oyunbazlıq. *Fokus çıxarmaq.*

**FOKUSÇU** *is.* Fokus göstərən artist (bax **fokus**[2]). // *məc.* Hoqqabaz, oyunbaz.

**FOKUSLAMA** “Fokuslamaq”dan *f.is.*

**FOKUSLAMAQ** *f.* 1. *fiz.* Şüaları fokusda birləşdirmək, bir nöqtəyə yığmaq (bax **fokus**[1] 1-ci mənada). *Şüaları fokuslamaq.*

2. *fiz. fot.* Fokusunu tapmaq (bax **fokus**[1] 2-ci mənada). *Fotoaparatı fokuslamaq.*

**FOLKLÓR** *is.* [*ing.* folklore – xalq müdrikliyi] 1. Şifahi xalq yaradıcılığı. *Musiqi folkloru. Folkloru tədqiq etmək. – Məndə uşaqlıqdan folklora maraq oyadan Yusif əmi olmuşdur.* A.Şaiq.

2. Hər hansı xalqın adət, ənənə, mahnı və s. məcmusu. *Azərbaycan folkloru.*

**FOLKLORÇU** *is.* Folklor mütəxəssisi; folklorşünas. *Folklorçu alim. – Zərdabi özü fədakar folklorçulardan biri kimi məşhurdur.* “İncəsənət”.

**FOLKLORÇULUQ** *is.* 1. Folklor haqqında elm.

2. Folklorçunun sənəti, peşəsi, ixtisası. *Folklorçuluqla məşğul olmaq.*

**FOLKLORŞÜNAS** bax **folklorçu**.

**FOLKLORŞÜNASLIQ** bax **folklorçuluq**. *Romantizmin inkişafı folklorşünaslığın yaranmasına təkan verdi.*

**FON** [*fr.* fond – zəmin, əsas] 1. Üzərində şəkil çəkilən, naxış salınan əsas rəng; zəmin, ton. *Açıq fon. Şəkil mənzərəli bir fonda çəkilmişdir. – Firidunun dostları və tanışları ilə çiçəklik fonunda çəkdirdiyi şəkil*

*ortada idi.* M.Hüseyn. // Üzərində naxış salınan şey; yer (parça, xalça və s. haqqında). *Xalçanın göy fonu.*

2. B a x **zəmin** 3-cü mənada. *Dramatik konflikt müəyyən dərəcədə dövrün ziddiyyətləri fonunda inkişaf etdiyindən sərtdir, kəskindir.* M.İbrahimov.

**fon** [*yun.*] Bəzi mürəkkəb sözlərin "səs, səslənmə" mənasını verən ikinci tərkib hissəsi; məs.: meqafon, saksafon, telefon, diktofon.

**FOND** [*fr.*] 1. Hər hansı məqsəd üçün ayrılan pul və ya maddi vəsait. *Valyuta fondu. Əmək haqqı fondu. Nobel fondu. İməcilikdən əldə edilən vəsait sülh fonduna keçirilmişdir.* // Bir şeyin əsas ehtiyatını təşkil edən pul və ya maddi vəsait. *Arxiv fondu. Kitabxana fondu. Bölünməz fond.*

2. *mal. cəm şəklində.* Faizli, qiymətli kağızlar. *Dövlət fondları və səhmləri.*

3. Yaradıcı xadimlərə (memarlara, yazıçılara, rəssamlara və b.-na) maddi yardım göstərən təşkilat, idarə. *Azərbaycan Ədəbiyyatı fondu. Elm fondu.–* [Şəkillərin] *hər ikisi bədii fondun nəşri idi.* M.İbrahimov.

**FONÉM** [*yun.* phonema – səs] *dilç.* Hər hansı bir dilin (və ya dialektin) söz və ya morfeminin mənasını fərqləndirmək vasitəsi sayılan danışıq səsi. *Hər bir dildə müəyyən sayda fonem olur.*

**FONENDOSKÓP** [*yun.* phone – səs, endon – daxilə və skopeo – baxıram] Ürək və ciyərlərə qulaq asmaq üçün stetoskopdan daha mükəmməl tibb aləti. *Balacayev əvvəlcə stetoskopla, sonra qoşa rezinli fonendoskopla* [Sübhanverdizadənin] *sinəsini də yaxşı-yaxşı dinlədi.* S.Rəhimov.

**FONETÍK** *sif.* 1. Fonetikaya aid. *Fonetik transkripsiya. Fonetik qanunlar.*

2. İnsan nitqinə, onun səs quruluşuna aid olan. *Sözün fonetik təhlili.*

**FONÉTİKA** [*yun.* phonetike – səsə aid] 1. Dilin səs quruluşu, səs tərkibi. *Azərbaycan dilinin fonetikası.*

2. Dilçiliyin, dilin səs tərkibini öyrənən bəhsi. *Tarixi fonetika. Fonetikanın əsas tədqiqat obyekti.*

**FONETÍST** [*yun.*] Fonetika mütəxəssisi.

**FONÓQRAF** [*yun.* phone – səs və grapho – yazıram] Səsi yazmaq və səsləndirmək üçün cihaz; səsyazan. *Qrammofon və patefon da fonoqraf əsasında yaradılmışdı.*

**FONOQRÁM** [*yun.* phone – səs və gramma – yazı] *xüs.* Plastinka, lent, plyonka və s.-yə keçirilmiş hər hansı səs yazısı. *Mexaniki fonoqram.*

**FONOLÓGİYA** [*yun.* phone – səs və logos – elm] Fonetikanın, dildəki fonemlərin sistemini və onların dəyişməsini öyrənən bəhsi. *Dilin fonemlər sistemi fonologiya ilə müəyyənləşdirilir.*

**FONOLOJİ** *sif.* Fonologiyaya aid. *Fonoloji tədqiqat. Fonoloji sistem* (*fonemlər sistemi*).

**FONÓMETR** [*yun.* phone – səs və metreo] Səsin gücünü ölçmək üçün alət, fonometrik cihaz.

**FONOMETRÍK** *sif.* Fonometriyaya aid. *Fonometrik tədqiqat.* ☐ **Fonometrik cihaz** – b a x **fonometr**.

**FONOSKÓP** [*yun.* phone – səs və skopeo – baxıram] Nitqin fonetik xüsusiyyətlərini və danışarkən dodaqların, üz əzələlərinin hərəkətini öyrənmək üçün cihaz.

**FONOTÉKA** [*yun.* phone – səs və theke – saxlanılan yer, anbar] Fonoqramların, səs yazılarının toplusu, arxivi. *Tədris fonotekaları. Şəxsi fonoteka. Azərbaycan Dövlət Konservatoriyasının fonotekası.*

**FONTÁN** [*ital.* fontana, əsli *lat.* fons – bulaq] b a x **fəvvarə.** *Fontan armaturu. Fontan üsulu ilə neftçıxarma.*

**FÓRİNT** *is.* Macarıstanda pul vahidi.

**FÓRMA** [*lat.* forma] 1. Şeyin xarici görünüşü, şəkli. *Yarpağın forması. – Müsəlman papaqlarının ağırlığı, böyüklüyü və formaları Molla Nəsrəddinin dostlarına necə ki lazımdır, əyandır...* C.Məmmədquluzadə. // İnsan bədəni hissələrinin, fiqurunun çevrəsi. *Uzun zaman əzələlər fəaliyyətsiz qaldıqda və fiziki hərəkətlər çatışmadıqda insan bədəninin forması dəyişir.* (Qəzetlərdən).

2. Tip, quruluş, təşkilat sistemi; struktur. *Yeni dövlət forması. İdarə forması. Təşkilat forması.* // Növ müxtəlifliyi. *Revmatizmin*

*ağır forması.* // İfadə üsulu, qaydası. *Danışıq forması.*

3. Bədii əsərin növü, janrı. *Müxtəlif forma və janrda çoxlu musiqi əsəri yaradılmışdır. – İkinci dövrün xüsusiyyəti məndəricənin genişlənməsində, müxtəlif dramatik formaların* (*melodram, faciə*) *meydana çıxmasındadır.* M.İbrahimov.

4. Ülgü, biçim, şablon, nümunə. *Milli xalq geyimlərinin tədqiq edilib öyrənilməsi yeni modaların biçim və formalarının zənginləşməsinə kömək edər.* (Qəzetlərdən). // Mətbəə naborunun qoyulduğu çərçivə, habelə çərçivəyə qoyulmuş naborun özü.

5. Bir şeyin müəyyən olunmuş nümunəsi, tipi. *Bülleten forması. Hesabat forması. Anketin forması.*

6. Rənginə, biçiminə və başqa əlamətlərinə görə müxtəlif kateqoriyalara mənsub şəxslər üçün vahid paltar tipi; rəsmi paltar, geyim. *Hərbi forma. Məktəbli forması. Dəmiryolçu forması. – Bahar fəslinin axırında Mirzə Səfərin oğlu darülfünun tələbəsi formasında evlərinə görüşməyə gəldi.* Ə.Haqverdiyev. *Milis işçilərinin özləri də forma deyil, adi paltar geymişdilər.* H.Seyidbəyli.

7. *dilç.* Qrammatik kateqoriyaların, söz və cümlələrin qarşılıqlı əlaqəsini zahirən ifadə edən vasitə. *Sözün forması. Felin qeyri-müəyyən forması.*

8. *inc. ədəb.* Bir şeyin məzmununu ifadə etmək üçün istifadə olunan bədii vasitələr sistemi. *Bayatının müxtəlif formaları. – Hindistan indi də müxtəlif və zəngin rəqs formalarının xəzinəsi hesab olunur.* "Azərb.".

**FORMÁL** *sif.* 1. Rəsmi, qanuni formaya uyğun olan. *Formal sübut. Formal təsir.*

2. Yalnız forma (zahir) üçün olan, işin həqiqi vəziyyəti ilə hesablaşmayan, rəsmiyyətçilik xatirinə olan. *Canlı iş olduğu üçün buna qətiyyən formal* (z.) *yanaşmaq olmaz.*

3. *dilç.* Formaya aid olan (b a x **forma** 7-ci mənada). *Sözün formal mənası* (sözün qrammatik mənası).

◊ **Formal məntiq** – təfəkkürün elementar qanun və formaları haqqında elm.

**FORMALI** *sif.* Müəyyən formada tikilmiş, müəyyən formada olan (b a x **forma** 6-cı mənada). *Formalı geyim.* // Belə paltar geyinmiş. *Əsgər formalı gənc.*

**FORMALÍN** [*lat.* formica – qarışqa] Kəskin boğucu iyi olan dezinfeksiya maddəsi. *Formalin iyi.*

**FORMALÍST** [*lat.*] 1. İşin mahiyyətinin zərərinə olaraq bir şeyə formal münasibət bəsləyən adam; rəsmiyyətçi.

2. Formalizm tərəfdarı (b a x **formalizm** 2-ci mənada). *Formalistlər etikanın vəzifələri içərisindən əxlaq problemlərinin öyrənilməsini çıxarıb atırlar.*

**FORMALÍZM** [*lat.*] 1. İşin mahiyyəti zərərinə olaraq, onun ancaq zahiri cəhətinə riayət etmə; bir şeyə ciddi formal münasibət; rəsmiyyət, rəsmiyyətçilik.

2. Məntiqdə, sənətşünaslıqda və s. elmlərdə ideya məzmunundan, obyektiv varlıqdan, ictimai təcrübədən sərf-nəzər edərək, yalnız formanı (zahiri cəhəti) əsas götürən və ona üstünlük verən cərəyan. *Formalizm meyilləri. Formalizmin bütün təzahürlərinə qarşı mübarizə.*

**FORMASIZ** *sif.* 1. Müəyyən forması, şəkli olmayan.

2. Forması (6-cı mənada) olmayan, forma geyməmiş. *Formasız əsgər.*

**FORMÁSİYA** [*lat.* formatio – təşəkkül, növ] *kit.* Bir şeyin inkişafında müəyyən pillə, mərhələ; məhz həmin pilləyə, inkişaf mərhələsinə xas olan tip; quruluş. *Geoloji formasiya.*

◊ **İctimai-iqtisadi formasiya** *fəls. iqt.* – insan cəmiyyətinin, müəyyən istehsal münasibətləri sistemi ilə səciyyələnən inkişaf mərhələsi.

**FORMÁT** [*alm.*] 1. Kitabın, səhifənin, kartoçkanın və s.-nin ölçüsü; əndazə. *Böyük format. Kiçik format. Kiçik formatda fotoşəkil.*

2. *mətb.* Nabor səhifəsinin uzunluğu və hündürlüyü, sətrin uzunluğu.

**FÓRMUL** [*lat.* formula – forma, qayda] Düstur. *Sərgidə çoxlu həndəsi fiqurlar, riyazi sxemlər və formullar vardır.*

**FORMULYÁR** [*alm.*] 1. *xüs.* Hər hansı bir qurğu, mexanizm və s. haqqında əsas məlumatlar yazılan, onun işlənməsi, xarab olması, təmiri və s. müntəzəm surətdə qeyd

olunan xüsusi dəftər və ya blank. *Təyyarənin formulyarı. Maşının formulyarı.*

2. Kitabxana kitablarının içinə qoyulan, habelə oxucuların onlardan istifadə etməsi haqqında orada qeydlər edilən uçot kartoçkası. *Kitabın formulyarı.* // Hər bir kitabxana oxucusu üçün doldurulan və ona verilən kitabların qeyd olunduğu kiçik dəftərçə. *Oxucunun formulyarı.*

**FORS** [*fr.* force – güc, əhəmiyyət] İddia, təkəbbür, lovğalıq, təşəxxüs. [Kərbəlayı:] *Bu nə forsdur, ay Nabat xanım?* S.Rəhimov. ☐ **Fors eləmək (satmaq, atmaq)** – bax **forslanmaq**. [Şahsənəm:] *Məşədi İbadın arvadı Püstə əllərini belinə qoyub bizə fors atırdı.* S.S.Axundov. *Mayis yenə də lovğalandı və fors satır kimi cavab verdi.* Ə.Vəliyev. [Ata:] [İlyas] *çox da fors eləməsin.* Ə.Məmmədxanlı.

**FORSLANMA** "Forslanmaq"dan *f.is.*

**FORSLANMAQ** *f.* Fors etmək, lovğalanmaq, təkəbbür satmaq, təşəxxüs satmaq, təşəxxüslənmək. [Tahir:] *Deməsinlər ki, Tahir forslanıb bizi saymadı.* M.Hüseyn.

**FORSLU** *sif.* Fors edən; lovğa, təkəbbürlü, təşəxxüslü. *Forslu qadın. – Fərəc bəy də atası kimi forslu, təşəxxüslü, paxıl, dargöz bir adam imiş.* Ə.Vəliyev.

**FORSUNKÁ** [*ing.* force-pump – basıcı nasos] Maye və ya tozşəkilli maddələri, başlıca olaraq maye halında olan yanacağı tozlandırmaq üçün cihaz, alət. *Forsunkanın gurultusu çörəkxananı başına almışdı.* Mir Cəlal. *Xəlil keçdikcə kürələrin forsunkalarına baxırdı.* Ə.Əbülhəsən.

**FORT** *is.* Qala tikililərinin tərkib hissəsi. *Açıq və qapalı tipli fortlar olur.*

**FORTEPİÁNO** [*ital.*] Zərbli-dilli simli musiqi aləti. *Fortepiano konserti. Fortepiano çalmaq. – Kamera musiqisində görkəmli yer tutan janrlardan biri də fortepiano üçün bəstələnən prelüdlərdir.* Ə.Bədəlbəyli.

**FORTOÇKÁ** [*rus.*] *dan.* Otağın havasını dəyişmək üçün pəncərədə düzəldilən qapıcıq, nəfəslik. *Fortoçkanı bağlamaq. – Qədir gözlərini açıq fortoçkaya zillədi.* Ə.Vəliyev.

**FÓRUM** [*lat.*] 1. *tar.* Qədim Romada: şəhərin ictimai həyatının mərkəzləşdiyi yer; meydan. *İmperiya dövründə forumların sayı artmışdı.*

2. *məc.* Geniş nümayəndəli yığıncaq. *Gənclərin beynəlxalq forumu.*

**FOSFÁT** [*yun.*] *kim.* Gübrə kimi, habelə texnikada, tibdə işlədilən fosfor turşusu duzu. *Polimer fosfatların xassələri.*

**FÓSFOR** [*yun.* phos, phoros – işıqsaçan] Bəzi mineralların, heyvanların sümüklərinin, heyvan və bitki toxumalarının tərkibində olan, tezalışan və qaranlıqda işıq verən kimyəvi maddə. *Ağ fosfor. Qırmızı fosfor.*

**FOSFORÍT** [*yunancadan*] Fosfat maddəsi ilə zənginləşmiş süxur (qumdaşı, əhəngdaşı və s.).

**FOSFORLU** *sif.* Tərkibində fosfor olan. *Fosforlu çuqun.*

**FOSGÉN** [*yun.* phos – rəng və genos – mənşə] *kim.* Nəfəs orqanlarına bərk təsir edən, xlorla karbon oksidinin birləşməsindən alınan zəhərli rəngsiz boğucu qaz. *Fosgen Birinci Dünya müharibəsində zəhərləyici maddə kimi işlədilmişdi.*

**FOTÓ** [*yun.* phos – işıq] bax **fotoqrafiya** 2-ci mənada. *Rəngli foto.*

**foto...** [*yun.* phos, photos – işıq] İşıq, işıq şüaları vasitəsilə işləyən, görülən, ya işıqdan törəyən mənasında olan, yaxud da fotoqrafiyaya aidliyi bildirən mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: fotosərgi, fotoşəkil, fotodiaqram, fotomüxbir, fotohəvəskar, fotoböyüdücü və s.

**FOTOAPARÁT** [*yun.* phos və *lat.* apparatus] Fotoqrafiya aparatı. *Yeni markalı fotoaparat. – İmamzadə fotoqrafı görmədikdə tez divardan asılmış fotoaparatı götürdü.* Q.İlkin. *Kamil fotoaparatını götürdü, qızının əlindən tutub həyətə, çiçək ləkləri olan yerə düşdü.* M.Süleymanov.

**FOTOATELYÉ** [*yun.* phos və *fr.* atelier] İri fotoqrafiya emalatxanası. *Fotoatelyedə şəkil çəkdirmək.*

**FOTOBÓMBA** [*yun.* phos və *fr.* bomba] Gecə havadan şəkil çəkərkən istifadə olunan təyyarə bombası.

**FOTOBÖYÜDÜCÜ** *is.* Surəti çıxarılarkən fotoşəkilləri böyüdən proyeksiya aparatı. *Şaquli fotoböyüdücü.*

**FOTOELEMÉNT** [*yun.* phos – işıq və *lat.* elementum – ünsür] İşıq enerjisini elektrik enerjisinə çevirən cihaz. *Fotoelementin optimal iş rejimi.*

**FOTOGENÍK** *sif.* [*yun.*] Fotoqrafiyada və ya kinoekranda əks etdirilmək üçün yararlı, münasib olan, fotoda yaxşı çıxan. *Onun çox yaxşı fotogenik sifəti var.* – [Aslanov:] *Yox, əzizim, mənim sifətim o qədər də fotogenik deyil.* M.Hüseyn.

**FOTOHƏVƏSKAR** [*yun.* phos, *ər.* həvəs və *fars.* ...kar] b a x **fotosevər**. *Fotohəvəskarlar klubu.*

**FOTOXRÓMİYA** [*yun.*] Şeyin təbii rənglərini əks etdirən rəngli fotoqrafiya.

**FOTOXRÓNİKA** [*yun.*] Hadisələrin fotoşəkillərlə göstərilməsi.

**FOTOKAĞIZ** *is.* Fotoşəkil çap etmək üçün bir üzünə işığa həssas maddə çəkilmiş kağız.

**FOTOKERÁMİKA** [*yun.*] Saxsı şeylər üzərinə fotoqrafiya üsulu ilə vurulan bəzək.

**FOTOKÍMYA** [*yun.* phos və *ər.* əlkimya] Kimyanın, şeylərin işıq enerjisi və ya ultrabənövşəyi şüaların təsiri altında əmələ gələn kimyəvi reaksiyanı və dəyişməsini öyrənən bəhsi.

**FOTOKİMYƏVİ** *sif.* [*yun.* phos və *ər.* kimyəvi] 1. Fotokimyaya aid olan, fotokimya ilə əlaqədar olan. *Fotokimyəvi reaksiya. İlk fotokimyəvi qanunauyğunluqlar XIX əsrdə müəyyən edilmişdir.*

2. Fotoqrafiyada tətbiq edilən kimyəvi preparatlara aid olan. *Fotokimyəvi mallar.*

**FOTÓQRAF** [*yun.*] 1. Bir sənət kimi fotoqrafiya ilə məşğul olan adam; fotoqrafçı, şəkilçəkən. "*Mingəçevir inşaatçısı*" *qəzeti öz fotoqraf və müxbirlərini də bu dəstəyə qoşmuşdu.* Ə.Sadıq. *Bir neçə gün idi ki, fotoqraf hər gün səhərlər .. qəbul otağını kəsdirib dururdu.* Q.İlkin.

2. B a x **fotoqrafiya** 3-cü mənada. *Heç* [Mayanın] *yadından çıxmaz, onda ata və anası Mayanı yaxşı-yaxşı geyindirib fotoqrafa apardılar.* M.İbrahimov.

**FOTOQRAFÇI** *is. dan.* Fotoqraf.

**FOTOQRAFXANA** [*yun.* phos – işıq və *fars.* ...xanə] b a x **fotoqrafiya** 3-cü mənada. *Fotoqrafxanada şəkil çəkdirmək.*

**FOTOQRAFÍK** *sif.* 1. Fotoqrafiya üçün olan, fotoqrafiyaya aid olan (b a x **fotoqrafiya** 1-ci mənada). *Fotoqrafik kamera.*

2. Fotoqrafiya vasitəsilə alınan, fotoaparatla çəkilən. *Fotoqrafik reproduksiya. Fotoqrafik şəkil. – Ay onu əhatə edən ulduzlar fonunda fotoqrafik üsulla müşahidə edilmişdir.*

3. Həyatda, həqiqətdə olduğu kimi, necə var elə. *Hadisənin fotoqrafik təsviri.* // Obyektivcəsinə, naturalistcəsinə.

**FOTOQRÁFİYA** [*yun.* phos – işıq və grapho – yazıram] 1. Xüsusi optik cihazlar vasitəsilə işıq şüalarının köməyilə işığahəssas materiallar üzərində şəkilalma üsulu. *Rentgen şüaları fotoqrafiyada və bəzi xəstəliklərin diaqnostikasında tətbiq edilməklə bərabər, müalicə məqsədilə də işlədilə bilər.* A.Qarayev.

2. Bu üsulla alınan şəkil, əks, foto, kartoçka. [Rüstəm bəy] *divardakı böyük tablolara tamaşa edir, qız fotoqrafiyalarını seyr edib, gəlib oturdu.* Çəmənzəminli.

3. Bu cür şəkilləri çəkmək və hazırlamaq üçün emalatxana; fotoqrafxana. *Fotoqrafiyada şəkil çəkdirmək.*

4. *xüs.* Hər hansı bir iş, proses və s. üzərində müşahidə və ona sərf olunan vaxtın qeydə alınması.

**FOTOQRAFLIQ** *is.* Fotoqrafın işi, sənəti, peşəsi. [Gənc:] *Mənimki fotoqraflıqdır, vəssalam...* S.Vəliyev.

**FOTOQRAVǗRA** [*yun.*] Fotokimyəvi üsulla işlənmiş metal plastinkadan üzü çıxarılmaqla alınan şəklin və ya fotoşəklin surəti. *Fotoqravüra maşını.*

**FOTOLABORATÓRİYA** [*yun.* phos və *lat.* laborare] Foto ilə çəkilən şəkillərin sonradan işlənməsi üçün laboratoriya. *Səyyar fotolaboratoriyalar.*

**FOTOLAMPÁ** [*yun.* phos və *fr.* lampe] Fotoqrafiyada işlədilən qırmızı lampa.

**FOTOLİTOQRAFÍK** *sif.* [*yun.*] Fotolitoqrafiyaya aid olan. *Fotolitoqrafik çap üsulu.*

**FOTOLİTOQRÁFİYA** [*yun.*] *mətb.* Fotoqrafiya tətbiq olunan litoqrafiya. *Fotolitoqrafiya üsulları.*

**FOTÓLİZ** [*yun.*] *fiz. kim.* Maye, bərk və ya qazvari maddələrin işığın təsiri altında parçalanması.

**FOTOMAĞAZA** [*yun.* phos və mağaza] Fotoqrafiya ləvazimatı satılan mağaza.

**FOTOMATERİÁL** [*yun.* phos və *lat.* materialis] 1. Fotoşəkillər çəkmək üçün lazım olan materiallardan hər hansı biri. *Fotomaterial satışı.*

2. Hər hansı məqsəd üçün istifadə olunan fotoşəkillər. *Sərgi üçün fotomaterial.*

**FOTOMEXÁNİKA** [*yun.*] *mətb.* Reproduksiya üsullarının məcmusu (bu üsulda rəssamın, litoqraf fəhlənin əllə gördüyü işin çoxunu fotoqrafik və kimyəvi proseslər əvəz edir).

**FOTOMEXANİKİ́** *sif.* [*yun.*] Fotomexanika ilə əlaqədar olan, fotomexanikaya aid olan. *Fotomexaniki proseslər.*

**FOTÓMETR** [*yun.*] 1. *fiz.* Hər hansı mənbədəki işığın gücünü müəyyən etmək üçün cihaz. *Şüalanma kəmiyyətlərini ölçmək üçün fotometrlərdən istifadə olunur.*

2. *astr.* Ulduzların parlaqlığını müəyyən etmək üçün cihaz.

**FOTOMETRÍK** *sif.* [*yunancadan*] Fotometriyaya aid olan, fotometriya ilə əlaqədar olan. *Fotometrik üsul. Fotometrik tədqiqat.*

**FOTOMÉTRİYA** [*yun.*] Optikanın, işığın gücünü, işıq mənbələrinin parlaqlığını və s.-ni ölçməklə məşğul olan sahəsi. *Fotometriyanın əsas kəmiyyətləri.*

**FOTOMONTÁJ** [*yun.* phos və *fr.* montage] Ümumi mövzuya aid olan bir sıra fotoşəkillərin (və ya onların hissələrinin) bir şəkildə birləşdirilməsi. // Bu yolla tərtib olunmuş plakat, reklam, illüstrasiya və s. *..C.Cabbarlı adına kitabxanada A.P.Çexovun həyatı və yaradıcılığına həsr olunmuş guşələr və fotomontajlar düzəldilmişdir.* (Qəzetlərdən).

**FOTOMÜXBİR** *is.* [*yun.* phos və *ər.* müxbir] Dövri mətbuat orqanı (qəzet, jurnal və s.) üçün şəkil çəkən fotoqraf.

**FOTOOBYEKTİ́V** [*yun.* phos və *lat.* objectum] Fotoaparatın obyektivi.

**FOTOREPORTÁJ** [*yun.* phos və *fr.* report] Fotoşəkillər vasitəsilə verilən reportaj; bu vasitə ilə reportaj vermə.

**FOTOREPORTYÓR** [*yun.* phos və *fr.* reporter] Fotoreportajla məşğul olan fotoqraf.

**FOTOSEVƏR** *is.* Həvəskar fotoqraf, həvəskar kimi fotoqrafiya ilə məşğul olan adam. *Fotosevərlərin sərgisi. Fotosevərlərin seminarı.*

**FOTOSƏRGİ** *is.* Fotoşəkillərdən ibarət sərgi. *Qələbə gününə həsr edilmiş fotosərgi. Fotosərgiyə tamaşa etmək.*

**FOTOSİNKOQRÁFİYA** [*yun.* phos, *alm.* zink və *yun.* grapho] *mətb.* Çap üçün sink klişelər hazırlamağın fotomexaniki üsulu.

**FOTOSURƏT** [*yun.* phos və *ər.* surət] Sənədin, əlyazmasının və s.-nin fotoqrafiya üsulu ilə çıxarılmış surəti, üzü, nüsxəsi. *Əlyazmanın fotosurəti.*

**FOTOŞƏKİL** [*yun.* phos və *ər.* şəkl] Foto ilə çəkilmiş şəkil; fotoqrafiya, şəkil. *Fotoşəkillər üzrə müsabiqə. – Divara Qulunun .. fotoşəkilləri vurulmuşdu.* İ.Əfəndiyev.

**FOTOTÉKA** [*yun.*] Fotoşəkillərin və ya fotoqrafiya neqativlərinin toplanılıb saxlandığı yer, arxiv.

**FOTOTELEQRÁF** [*yun.*] Hərəkətsiz təsvirləri (şəkil, əlyazması, fotoşəkil və s.) teleqraf və ya radio vasitəsilə uzaq məsafəyə vermək üçün aparat. *Rabitə salonunda yeni fototeleqraf cihazı qoyulmuşdur.* (Qəzetlərdən).

**FOTOTELEQRÁM** [*yun.*] Fototeleqraf vasitəsilə verilən teleqram.

**FOTOTERAPİ́YA** [*yun.*] Günəşdən və ya süni mənbələrdən alınan işıq şüalarının müalicə məqsədilə tətbiq olunması; işıqla müalicə. *Şişlərdə, qanaxmalarda, ürək-damar çatışmazlığında, böyrək xəstəliklərində fototerapiyadan istifadə etmək olmaz.*

**FOYÉ** [*fr.*] Teatr, kino və s.-də tamaşaçıların fasilələrdə tamaşanın başlanmasını dayanıb gözləməsi üçün xüsusi yer. *Foyedə gəzişmək.* ◻ **Artist foyesi** – fasilələrdə artistlərin dincəlməsi üçün xüsusi yer, otaq (teatrda və s.-də).

**FÖHŞ** *is.* [*ər.*] *klas.* Nalayiq söz, söyüş; ədəbə, tərbiyəyə və əxlaqa müğayir hərəkət, iş, əməl; əxlaqsızlıq. *Sarıköynəyin əri əsəbi bir halda föhş və söyüşlə mənim mənzilimə gəldi.* S.Hüseyn. ◻ **Föhş vermək** – söymək, nalayiq sözlər demək, ağzına gələni demək. [M.F.Axundzadə:] *Avam əvvəl sənin nəsihətini anlamayacaq, sənə əziyyət edəcək, föhş verəcək.* Ə.Haqverdiyev. *Zeynal bəy qorodovoyların qarasına söyləndikcə*

*odlanıb, növbənöv föhşlər verməyə başladı.* Çəmənzəminli.

**FÖHŞİYYAT** [*ər.* "föhş" söz. cəmi] Ədəbə, tərbiyəyə və əxlaqa müğayir iş, əməl, hərəkət; əxlaqsızlıq. // Əxlaqsız və ədəbsiz səhnələri təsvir edən ədəbi əsərlər və ya şəkillər.

**FÖVC** *is*. [*ər.*] *köhn.* Camaat, kütlə, dəstə.

**FÖVQ** *is.* [*ər.*] Yuxarı, üst. *Çıxacaqlar göyləri aşaraq dönə-dönə; Buludların fövqünə.* M.Müşfiq. // Üstün, daha artıq. *Gecələr ayazda, gündüzlər al günün altında gəmi muzdurunun zəhməti hər bir zəhmətdən fövqdür.* S.M.Qənizadə.

**FÖVQƏLADƏ** *sif.* [*ər.*] 1. Qeyri-adi, adətdənxaric, görünməmiş, eşidilməmiş. *Hamam səfəri kimi fövqəladə hadisələr tez-tez ittifaq düşməzdi, həftədə bir dəfə olardı.* Çəmənzəminli. [Səriyyə:] *Mən fövqəladə bir iş görən adamlar kimi ciddi və həyəcanlı idim.* İ.Əfəndiyev. // Başqalarından ayrılan, başqalarına bənzəməyən; qeyri-adi, müstəsna. *Zeynal özünü fövqəladə bir adam hesab edirdi.* S.Hüseyn. *Amsar kəndinin fövqəladə bir kənd olmadığını söylədik.* Ə.Sadıq. // Son dərəcə güclü. [Tahirin] *uşaq xəyalında Dilman fövqəladə bir cəngavər kimi ucalmışdı.* M.Hüseyn. *Sərvinaz qarı içəridən od tutub alovlansa da, fövqəladə bir mətanət göstərir, evinə gəlib-gedənlərə ürək-dirək verirdi..* B.Bayramov.

2. Təcili, xüsusi olaraq müəyyən olunmuş, qəbul edilmiş, növbədənxaric. *Fövqəladə qurultay. Fövqəladə tədbirlər. Fövqəladə vəkalət.* // Ölkənin həyatında əmələ gələn müstəsna vəziyyətdən törəyən, onunla əlaqədar olan. *Fövqəladə vəziyyət* (ölkədə və ya onun hər hansı bir hissəsində müəyyən vaxt ərzində həyata keçirilən və əhalinin vətəndaşlıq hüquqlarını məhdudlaşdırmaqdan, hakimiyyəti hər hansı xüsusi orqana verməkdən və s.-dən ibarət xüsusi hüquqi vəziyyət). *Fövqəladə vergi*(*lər*) (ölkədə hər hansı bir xüsusi hadisə baş verdikdə qoyulan məcburi vergi növü). *Fövqəladə qanunvericilik* (hərbi və ya mühasirə vəziyyəti dövründə tətbiq olunan və hökumətə xüsusi səlahiyyətlər verən qanunlar). *Fövqəladə Komissiya* (sovet hökumətinin ilk illərində əksinqilab, möhtəkirlik və vəzifə cinayətləri ilə mübarizə aparmaq üçün mövcud olmuş dövlət orqanı).

**FÖVQƏLADƏLİK** *is.* Fövqəladə şeyin halı; qeyri-adilik, müstəsnalıq. [Komandir:] *Buna görə də mən vəziyyətin fövqəladəliyini elan edir, buna qarşı hazırlanmağı təklif edirəm.* S.Hüseyn. [Səriyyə:] *Tutaq ki, həyatda, doğrudan da, belə bir fövqəladəlik mümkündür.* İ.Əfəndiyev.

**FÖVQƏLBƏŞƏR** *is.* [*ər.*] Qeyri-adi əxlaqı, zehni, zəkası, təbiəti etibarilə adi insanlardan fərqlənən adam. [Dərviş Şeyx Sənana:] *Əgər fövqəlbəşər olmaq dilərsən*; *Kənar ol daima cinsi-bəşərdən*! H.Cavid. // Güclü iradəyə malik olub, özünü cəmiyyətdən yüksək, onun hüquqi və əxlaqi normalarından kənarda sayan adam.

**FÖVQƏLBƏŞƏRİ** *sif.* [*ər.*] Adi insan imkanlarını ötüb keçən; qeyri-adi. *Fövqəlbəşəri mətanət.*

**FÖVQƏLTƏBİİ** *sif.* [*ər.*] 1. Mistik təsəvvürə görə: təbii yolla izah oluna bilməyən, təbiətin qanunlarına tabe olmayan; əcaib. *Fövqəltəbii hadisə. Fövqəltəbii qüvvələrin varlığına inam.*

2. *məc.* Adi əndazədən xaric; qeyri-adi, qəribə, əcaib. *Fövqəltəbii səy.*

**FÖVQƏLTƏBİİLİK** *is.* Fövqəltəbii şeyin halı; qeyri-adilik.

**FÖVRƏN** *zərf* [*ər.*] Dərhal, həmin saat, əlüstü, tez. *Tülkü fövrən havada qapdı, yedi; Qarğaya tənə ilə böylə dedi.* M.Ə.Sabir. *Hacının halı fövrən dəyişdi.* Ə.Haqverdiyev.

**FÖVT** *is.* [*ər.*] 1. Əldən çıxma, əldən çıxarma, əldən qaçırma. *Fürsəti fövt etmək* (fürsəti əldən qaçırmaq).

2. Ölmə, ölüm. *Kim, fövti-rəqib eşitsə aşiq; Gülmək gərək, ağlamaq nə layiq?* Füzuli. ☐ **Fövt olmaq** – ölmək, məhv olmaq. *..Bizim şüəra cismən ölüb fövt olublarsa da, ruhən və mənən həlak olmayıblar.* F.Köçərli. [Dərviş:] *Ruqiyyə məhv oldu, fövt oldu.* A.Divanbəyoğlu.

**FRAK** *is.* [*fr.*] Qabaq ətəkləri kəsik, dal tərəfdən isə uzun dar ətəkləri olan kişi kostyumu – sürtük növü (adətən təntənəli hallarda, rəsmi qəbullarda və s.-də geyilir).

**FRAKLI** *sif.* Əynində frak olan, frak geymiş. *Fraklı dirijor.*

**FRÁKSİYA¹** [*fr.* fractio – hissə] 1. Parlamentdə, siyasi partiyada, ictimai təşkilatda və s.-də hər hansı partiya üzvlərindən ibarət mütəşəkkil qrup. [Ceyran:] *Rəyasət heyəti üzvüyəm. Fraksiya iclasına gedirəm.* S.Hüseyn.

2. Siyasi partiyada: partiyanın ümumi xətti ilə razılaşmayan, ondan fərqli və zidd xətt irəli sürən, partiya sıralarında qalmaqla onunla mübarizə edən dəstə, ayrıca qrup.

**FRÁKSİYA²** [*fr.* fraction – pay, hissə] *kim.* Distillə edilən maye qatışığının ayrıldığı hissəciklər. *Neftin fraksiyası.*

**FRAKSİYAÇI** *is.* 1. Hər hansı təşkilata ikitirəlik salan, onda fraksiya əmələ gəlməsinə səbəb olan adam (b a x **fraksiya¹**). *Fraksiyaçı qrup.*

2. Hər hansı fraksiyanın üzvü (b a x **fraksiya¹**).

**FRAKSİYAÇILIQ** *is.* Fraksiya ilə məşğul olma, fraksiya düzəltmə, fraksiya fəaliyyəti və ideologiyası (b a x **fraksiya¹**). *Fraksiyaçılıqla mübarizə.*

**FRAQMÉNT** [*lat.* fragmentum – sınıq, qırıq, parça] Qırıq, parça (məs.: hər hansı incəsənət – rəssamlıq, memarlıq, heykəltəraşlıq və s. əsərlərinin salamat qalmış hissəsi, parçası). *Baletdən fraqmentlər. Binanın fraqmenti. Rəsmin fraqmentləri.* // Əsərin, mətnin bir hissəsi, parçası. *Qədim əlyazmanın fraqmenti.*

**FRANK** *is.*[*fr.*] Fransada pul vahidi.

**FRANSIZ** *is.* Fransanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Fransız qoşunları bir sıra parlaq qələbələr qazandılar.*

**FRANSIZCA** *zərf* və *sif.* Fransız dilində. *Fransızca danışmaq. Fransızca-azərbaycanca lüğət.*

**FRÁZA** [*yun.* phrasis – ifadə] 1. *mus.* Musiqi mövzusunun hər hansı kiçik və nisbətən tam hissəsi. *Fraza, adətən iki motivdən ibarət olur.*

2. *dilç.* Cümlə, ifadə, ibarə. *Motivlərə bölünməyən bütöv frazalar da var.*

**FRAZEOLÓGİYA** [*yun.* phrasis – və logos] Hər hansı dilə xas olan sabit söz birləşmələri və ifadələrin məcmusu. *Azərbaycan dilinin frazeologiyası.* // Dilçiliyin, sabit söz birləşmələrini öyrənən sahəsi.

**FRAZEOLOJÍ** *sif.* [*yun.*] Frazeologiyaya aid olan. *Frazeoloji ifadələr. Frazeoloji lüğət.*

**FREQÁT** [*fr.*] Əvvəllər: üçdorlu yelkənli hərb gəmisi, sonralar isə gözətçi xidməti üçün çox sürətli hərb gəmisi. *Atom güc qurğulu freqatlar. Freqat kapitanı.*

**FRENÇ** [*xüs. addan*] Üstdən dörd cibi və daldan kəmərciyi olan hərbi gödəkcə. *Frenç geymiş zabit. – Müsafirlər frençlərini çıxarıb, yuyunmağa başladılar.* Çəmənzəminli. *Əynindəki yaşıl frenç, dizdən çəkmə, gümüşü papaq, enli toqqa Mədədi çox yaxşı tuturdu.* Ə.Vəliyev.

**FRENÇLİ** *sif.* Frenç geymiş, əynində frenç olan. *Bir ucaboy, qarasaç və frençli oğlan tribunaya çıxdı.* Mir Cəlal.

**FRENOLÓGİYA** [*yun.* phren – ağıl və logos – elm] Adamın psixi və əxlaqi keyfiyyətləri ilə onun kəlləsinin quruluşu arasında əlaqə olduğunu iddia edən qeyri-elmi nəzəriyyə. *Frenologiyanın elmi dəlillərə əsaslanmadığı sübuta yetirilmişdir.*

**FRENÓLOQ** [*yunancadan*] Frenologiya mütəxəssisi.

**FRÉSKA** [*ital.* fresco – təzə, qurumamış, yaş] *rəss.* Təzə mala üzərində sulu boya ilə çəkilmiş şəkil, rəsm, naxış. *Mikelancelonun freskaları. Freska divar rəsmlərinin əsas texnikasıdır.*

**FREYDÍZM** [Avstriya həkimi və psixoloqu Freydin adından] Psixologiya və psixopatologiyada insanın bütün hərəkətlərinin başlıca amilinin yalnız qeyri-şüuri bioloji instinktlər və meyillər olduğunu iddia edən, insanların həyatında sosial momentləri hesaba almayan və onların şüurlu fəaliyyətinin rolunu azaltmağa çalışan cərəyan. *Freydizmin müasir tərəfdarları. Klassik freydizmin metodoloji xüsusiyyətləri.*

**FREZ** [*fr.*] 1. Metalı, ağacı və s. bərk materialları işləmək üçün fırlanan çoxtiyəli kəsici alət. *Taxtanı frezdə yonmaq.*

2. Torpaq qazmaq və eyni zamanda onu yumşaltmaq, torf doğramaq və s. üçün irəli çıxmış fırlanan barabanda xüsusi tiyələri olan maşın. *Yol frezi.*

**FRÉZER** [*fr.*] bax **frez** 1-ci mənada. *Frez maşını. – Bunların arasında dişaçan maşın, frezer avtomatı, yonucu dəzgah, güclü hidravlik preslər və s. vardır.* (Qəzetlərdən).

**FREZERÇİ** *is.* Frezer dəzgahında işləyən fəhlə.

**FRİZ** *is.* [*fr.*] *arxit.* Ornamentli bəzək.

**FRONTİT** *is.* [*lat.*] Alın cibinin selikli qişasının iltihabı.

**FRUKTÓZA** [*lat.* fructus – meyvə] *kim.* Meyvələrdə, balda, bəzi bitkilərin yarpaqlarında və s.-də olan karbon; meyvə şəkəri.

**FUFAYKÁ** [*rus.*] 1. İsti, toxunma qollu və ya qolsuz köynək.

2. Sırıqlı gödəkcə.

**FUK** [*rus.*] Dama oyununda rəqibin diqqətsizliyi üzündən oyunçunun götürdüyü dama.

**FUKS** [*alm.*] Bilyard oyununda: şara təsadüfi olaraq vurulan müvəffəqiyyətli zərbə.

**FÚQA** [*ital.*] *mus.* 1. Eyni musiqi mövzusunun bir neçə səslə ardıcıl təkrarı.

2. Belə təkrara əsaslanan musiqi əsəri.

**FUQÁS** [*fr.*] *hərb.* Düşmənin keçəcəyi yerdə gözlənilmədən partlamaq üçün torpaq və ya su altına qoyulan partlayıcı maddə (mina). *Fuqas bombası.*

**FUQÁTO** [*ital.*] *mus.* Fuqa üslubunda işlənmiş musiqi mövzusu (fuqato adətən sonata və ya simfoniyanın bir hissəsini təşkil edir).

**FUNİKULYÓR** [*fr.*] Dik yoxuşlarda kanat dartı qüvvəsi ilə işləyən dəmir yolu. [Aqil] *oraya funikulyorla qalxmağı təklif etdikdə Gülnaz etiraz etmədi.* Q.İlkin. [Üçüncü katib Firəngizə:] *Bu yarğanın başından tuş İstisuya gözəl bir funikulyor çəkmək olardı.* B.Bayramov.

**FUNKSİONÁL** [*latıncadan*] 1. "Funksiya"dan *sif. Funksional asılılıq. Funksional münasibət.*

2. *sif.* Bir şeyin quruluşundan deyil, fəaliyyətindən asılı olan. *Ürək fəaliyyətinin funksional pozğunluğu* (ürəkdə anatomik dəyişiklik olmadan baş verən pozğunluq). – *Əgər xəstəlik zamanı yalnız üzvlərin normal işi pozularsa və orqanizmdə quruluş pozğunluğu nəzərə çarpmazsa belə xəstəlik funksional xəstəlik adlanır.* "İnsan nədən xəstələnir".

**FÚNKSİYA** [*lat.* functio – icra] 1. Vəzifə, fəaliyyət dairəsi.

2. *riyaz.* Qiyməti başqa dəyişən qiymətdən asılı və ona uyğun olan dəyişən kəmiyyət. *Triqonometrik funksiya* (bucağın kəmiyyətindən asılı olan kəmiyyət).

3. *biol.* Heyvan və ya bitki orqanizminin, onun hüceyrə və toxumalarının spesifik fəaliyyəti. *Ürəyin funksiyası. – Cinsi vəzilər hormonlar vasitəsilə bədənin başqa üzvlərinə, üzvlərin funksiyalarına təsir edir.* M.Axundov.

**FURAJKÁ** [*pol.*] Qabaq tərəfində günlüyü olan baş geyimi. *Əsgər furajkası. – Xalası isə öz hesabına Nəcəfə gimnazist furajkası aldırdı.* Q.İlkin.

**FURQÓN** [*fr.*] 1. İki (bəzən də bir) at qoşulan dördçarxlı üstüörtülü araba. *Mürsəl kişinin stansiyaya göndərdiyi böyük furqon meşənin ortasındakı araba yolu ilə kəndə gəlirdi.* M.Hüseyn. *Furqon Ağsudan ötüb çaya yaxınlaşanda ayrı bir mənzərə müşahidə olunurdu.* Mir Cəlal.

2. Yük maşınlarında, arabalarda və s.-də örtülü kuzov. // Baqajlığı kuzovda olan avtomaşın.

**FURQONÇU** *is.* Furqon (1-ci mənada) sürən adam.

**FURQONLU** *sif.* Furqonu (2-ci mənada) olan. *Furqonlu avtomaşın.*

**FUT** *is.* [*ing.*] İngilis ölçü sistemində 30 sm 48 mm-ə bərabər uzunluq vahidi.

**FUTBÓL** [*ing.*] Hər bir komandanın ayaq (və bəzən baş) zərbəsi ilə rəqibin qapısına mümkün qədər çox top (qol) vurmasından ibarət idman oyunu. *Futbol oynamaq. Futbol stadionu. Futbol mövsümü. Müasir futbolun əsas qaydaları XIX əsrin 60-cı illərində İngiltərədə işlənmişdir. Azərbaycanda ilk futbol komandaları 1911-ci ildə Bakıda yaradılmışdır.*

**FUTBOLÇU** *is.* Futbol oyunçusu. *Bakı futbolçuları 1912-ci ildə Tiflisdə ilk şəhərlərarası matç keçirmiş və qələbə qazanmışlar. – Yavaş-yavaş Mingəçevirin öz futbolçuları, voleybolçuları yetişirdi.* Ə.Sadıq.

**FUTBÓLKA** [*ing.* football və *rus.* ...ka] Trikotaj idman köynəyi.

**FUTLYÁR** [*alm.*] Saxlamaq və ya xarab olmaqdan, zədələnməkdən və s.-dən qorumaq üçün içinə şey qoyulan qutu və ya çexol; məhfəz, qab. *Klarneti futlyara qoymaq. Saatın futlyarı.*

**FUTURÍST** [*latıncadan*] 1. Futurizm tərəfdarı. *İtalyan futuristləri.*

2. Bax **futuristik**. *Futurist əsər.*

**FUTURİSTÍK** *sif.* [*latıncadan*] Futurizm ideyaları ilə aşılanmış; futurizmin ədəbi üsullarından istifadə edən, futurizm səpkisində işlənmiş. *Futuristik şeir. Futuristik şəkil.*

**FUTURÍZM** [*lat.* futurum – gələcək] XX əsrin əvvəllərində ədəbiyyat və incəsənətdə: realizmi, eləcə də mədəni irsi və müasiri olduğu incəsənəti rədd edən, guya zəmanəyə daha uyğun gələn, köhnə sənətin bütün ənənə və üsullarını dağıtmalı olan yeni üslub yaratmağa çalışan formalist cərəyan. *Qərb futurizminin başlıca xüsusiyyətləri.*

**FÜQƏRA** [*ər.* "fəqir" söz. cəmi] *klas.* Yoxsullar, kasıblar; əhalinin yoxsul təbəqələri. *Füqəranın qanını çox da sorurlar lotular; Şeyxlər xalqa satır huriyü qılman, mənə nə?* M.Ə.Sabir. *Ey füqəra, boş yerə ağlaşmayın; Hər kəsi görcək ona sallaşmayın.* Ə.Nəzmi.

**FÜQƏRAYİ-KASİBƏ** *is.* [*ər.*] 1917-ci il inqilabından qabaq və inqilabın ilk illərində "proletariat" mənasında işlədilmiş ifadə. [İlyas:] *Nə istəyirsən, ana, indi bütün elmin qapıları füqərayi-kasibə balalarının üzünə açıqdır.* S.Rəhimov.

**FÜNUN** *is.* [*ər.* "fənn" söz. cəmi] *klas.* Fənlər, elmlər, biliklər. *Onlar ki səninlədir müasir; Hər elmü fününə oldu mahir.* M.Ə.Sabir. [İrəvanda] *bizim dövlət tərəfindən açılan mədrəsələrdə ülum və fünun kəsb edən müsəlman şagirdləri başqalarına nisbətən çox azdır.* F.Köçərli.

**FÜRSƏT** *is.* [*ər.*] Bir sözü demək və ya bir işi görmək üçün əlverişli an, münasib vaxt, məqam, müvafiq hal. *Bu fürsət hər vaxt ələ gəlməz. – Qanadlı bir quşdur fürsət əzəldən..* S.Vurğun. ◻ **Fürsət aramaq (axtarmaq)** – bir iş üçün əlverişli məqam axtarmaq, güdmək. *Məsmə dərdlərini Tahirzadəyə danışmaq üçün vaxt, fürsət axtarırdı.* Mir Cəlal. **Fürsət bilmək** – fürsətdən istifadə etmək. *Qədir fürsət bilib yayındı, üzünü bağlara tərəf tutub yavaşca dala baxmadan gedirdi.* Mir Cəlal. **Fürsət bulunmaq** *klas.* – bax **fürsət tapmaq.** *Xoşdur ki, bulam vüsala fürsət; Yarım tərəfindən ola nüsrət.* Füzuli. **Fürsət düşmək** – əlverişli vaxt və şərait yaranmaq, imkan yaranmaq, məqam düşmək. *Anri fürsət düşdükcə* [ərəblərlə] *söhbət edirdi.* S.Vəliyev. [Katib:] *Bir az da gözləyin, fürsət düşən kimi deyərəm.* Q.İlkin. **Fürsət eləmək (etmək)** – bax **fürsət tapmaq.** [Salman:] *Fürsət eləyən kimi* [tülkü] *girinə keçəni qamarlayıb parçalayacaqdı..* M.İbrahimov. **Fürsət gözləmək** – bir iş üçün əlverişli an, məqam gözləmək. *Buludlar arxasında daldalanıb müəyyən fürsət gözləyən üç "M-109" birdən ildırım kimi şığıdı.* Ə.Vəliyev. **Fürsət tapmaq** – bir sözü demək və ya bir işi görmək üçün münasib, əlverişli vaxt tapmaq, fürsət etmək, fürsət bilmək. *Səkkiz gün olardı ki, gedib* [Hacı kişinin] *halını sormağa fürsət tapmamışdım.* Qantəmir. *Sərdar Rəşid bu xəyanətini həyata keçirmək üçün fürsət tapmayacaqdır.* M.S.Ordubadi. **Fürsət vermək** – şərait yaratmaq, imkan vermək, macal vermək (*çox vaxt inkarda işlədilir*). [Padşah] *elə Məlikəhmədə çatacaq, heç fürsət vermədi ki, ağzın açsın..* (Nağıl). *Çoban* [düşmənə] *qalxmağa fürsət verməyib, çomağı başına çırpdı və özü bağıryaran bir səslə qıy vurub irəli şığıdı.* M.Rzaquluzadə. **Fürsətdən istifadə etmək** – bir iş görmək üçün yaranmış əlverişli şəraitdən, vaxtdan faydalanmaq. [Yusif:] *Mən fürsətdən istifadə edib danışmaq istəyirəm.* B.Bayramov. **Fürsəti bada vermək** – bax **fürsəti əldən buraxmaq.** *Ey könül, fürsəti badə vermə, gəl; Gün keçir, ay keçir, il yaman gedir.* M.Rahim. **Fürsəti əldən buraxmaq (qaçırmaq, vermək, çıxarmaq)** – bir işi görmək üçün yaranmış şəraitdən və vəziyyətdən dərhal istifadə etməmək. [İzzət:] *Ah, sən neçin qandırmadın İsməti? Neçin əlindən çıxartdın fürsəti?* H.Cavid. [Sona:] *Biz indidən işə başlamasaq, fürsəti əldən buraxarıq.* H.Nəzərli. *Bu gün bu fürsəti*

*verməyib əldən; Könlüm istəyəni deyəcəyəm mən.* B.Vahabzadə. **Fürsəti fövt etmək (fövtə vermək)** – bax **fürsəti əldən buraxmaq. Fürsəti fövt etməmək (fövtə verməmək)** – bax **fürsətdən istifadə etmək.** *Hacı Rüstəm heç vaxt ömründə fürsəti fövt etməmişdi.* Ə.Haqverdiyev. *Lütfəli də fürsəti fövtə verməyib, dedi ki, dur gedək kazinoya, qəhvə içək.* İ.Musabəyov.

**FÜSUN** *is.* [*fars.*] *klas.* Sehr, əfsun. *Ana olmaz bizə hər bir "yavrum" deyən gözəldən; Çünki onun xilqətində ayrıca bir füsun var.* M.Müşfiq.

**FÜSUNKAR** *sif.* [*fars.*] Valehedici, məftunedici, heyranedici, əfsanəvi. *Füsunkar mənzərə. – Səmavi tüllərdən əynində köynək; Füsunkar bir gəlin oturmuşdu tək.* M.Dilbazi. *Bahar füsunkar, əfsanəvi gözəlliyilə bizim ellərə gəlirdi.* M.Rzaquluzadə.

**FÜSUNKARLIQ** *is.* Valehedicilik, heyranedicilik, əfsanəvi gözəllik. *Hüsnünün əsrarı, füsunkarlığı; Ana təbiəti andırır mənə.* B.Vahabzadə.

**FÜTUHAT** *is.* [*ər.* "fəth" söz. cəmi] 1. Bax **fəth.**

2. *məc.* Mübarizə, çalışma, zəhmət və s. nəticəsində əldə edilmiş şeylər. *..Qazandığınız fütuhatı möhkəmləndirin və bütün Şərq üçün nümunə olun.* Q.İlkin.

**FÜYUZAT** *is.* [*ər.*] *köhn.* Feyzlər.

**FÜZELYÁJ** [*fr.*] Təyyarənin, bütün hissələrini bir arada birləşdirən, ekipajın, sərnişinlərin və s.-nin yerləşdiyi əsas hissəsi (gövdəsi). *Bəzi uçuş aparatlarında füzelyaj qanadla birləşir.*

**FÜZUL** *is.* və *sif.* [*ər.* "fəzl" söz. cəmi] Uzunçu, çoxdanışan, naqqal, artıq sözlər danışan. *Füzulu saldılar cəhənnəmə. Dedi: – Odunu yaşdır.* (Ata. sözü). *Sən qulaq as, əzizim, olma füzul; Hər nə kim, mən desəm, sən eylə qəbul.* S.Ə.Şirvani.

**FÜZULLUQ** *is.* Uzunçuluq, naqqallıq. *Hacı xan sözə başlayaraq deyirdi: – Cənab axund, füzulluq olmasın, bir ərzim vardır.* M.S.Ordubadi. ◻ **Füzulluq eləmək** – uzunçuluq eləmək, naqqallıq eləmək, artıq-artıq sözlər danışmaq.

**FÜZUN** *sif. klas.* Artıq, çox. *Məndə Məcnundan füzun aşiqlik istedadı var; Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var.* Füzuli. ◻ **Füzun olmaq** – artmaq, çoxalmaq. *Füzun olduqca eşqim gərm olur əşkim gözüm içrə.* Füzuli. *Qəmü möhnət füzun oldu; Səbəb boynu yoğun oldu!* M.Ə.Sabir.

# Gg

**G** Azərbaycan əlifbasının doqquzuncu hərfi. b a x **ge**.

**GAH¹** [*fars.*] Cümlənin həmcins üzvlərini və tabesiz mürəkkəb cümlənin tərkib hissələrini bölüşdürmə əsasında birləşdirən bağlayıcı (əsasən təkrar edilərək işlədilir). *Gah ora, gah bura baxır.* – [Qəhrəman:] *Gah bizim qoşun, gah da üsyançılar qalib gəlirdilər.* H.Nəzərli. [Nadir] *nazik yorğanın altında gah bu böyrü, gah o böyrü üstə çevrilib çapalayırdı.* B.Talıblı. ☐ **Gah olur (ki)** – hərdənbir, bəzən, arabir. *Gah olur ki, danə, xuruş gəzərsiz; Siz düşərsiz pərişanə, durnalar!* M.V.Vidadi.

**GAH²** *məh.* b a x **büzmə** 2-ci mənada.

**GAHBAGAH** *zərf* [*fars.*] Hərdənbir, arabir, bəzən, gah-gah. *Əziz başın üçün oxu yazımı; Agah ol halımdan gahbagah mənim.* Qurbani. *Əzəldən var idi lütfü kərəmin; Gahbagah bəriyə seyrü-qədəmin.* M.P.Vaqif.

**GAHBİR** *zərf* Hərdən, bəzən, arabir, gahdanbir. *İnsaf üçün bunu da lazımdır demək ki, əcnəbilərin içində bu da gahbir ittifaq düşür ki, bir kişi hətta övrətinə məhəbbəti ola-ola bir özgə övrətə yavuq düşür.* C.Məmmədquluzadə.

**GAHDAN** *zərf* Bəzən, hərdən, arabir. *Başına döndüyüm alagöz Pəri; Gahdan ağla, gahdan yada sal məni.* Aşıq Abbas. *Gahdan çiskin tökər, gah duman eylər; Gah gəlibgedəni peşiman eylər; Gahdan qeyzə gələr, nahaq qan eylər..* Aşıq Ələsgər.

**GAHDANBİR** b a x **gahbir**. *Gahdanbir bizə gələrdi. – Hər dəfə çörək bişirən vaxt Həlimə xala iki, ya bəlkə üç övrət qonşularından özünə mədədçi çağırardı və gahdanbir Təzəkənddə bacısı Zibeydəyə xəbər verirdi ki, gəlib ona kömək eləsin.* C.Məmmədquluzadə.

**GAH-GAH** b a x **gahbagah**. *Bilmişəm bulmaq vüsalın, leyk bir ümmid ilə; Gahgah öz xatiri-naşadımı şad eylərəm.* Füzuli. [Dərviş:] *Malların gövşəyi, atların nəriltisi, gah-gah da itlərin mırıltısı qulağıma gəlirdi.* A.Divanbəyoğlu. *Səni bu cür böyüdənin dolanam başına gərək; Gah-gah əllərindən öpəm, gah-gah ətəyindən tutam.* Şəhriyar.

**GAH-GAHI** b a x **gah-gah**. *Əziziyəm, külahı*; *Götür başdan külahı*; *Oğul, böyüyəndə sal*; *Məni yada gah-gahı.* (Bayatı). *Unutmayın aşığı; Yada salın gah-gahı.* Sarı Aşıq.

**GAHGİR¹** *sif.* Yerişini tez-tez dəyişən, sabit yerişi olmayan. *Gahgir at.*

**GAHGİR²** *məh.* Narın sarı qum. *Daşın üstünə gahgir tökmək.*

**GAHGİRLİK¹** *is.* Gahgir atın xasiyyəti (b a x **gahgir¹**). *Bu atın gahgirliyi xoşuma gəlmir.*

**GAHGİRLİK²** *is.* Gahgir olan yer; qumluq (b a x **gahgir²**).

**GAHI** b a x **gah¹** *Gahı şaha bir tənə vurar, gahı vəzirə.* M.Ə.Sabir.

**GAHI-GAHI** b a x **gah-gah**. *Ey sevdiyim, qaydasıdır qızların*; *Gahı-gahı bu söz atmaq nədəndir.* Qurbani. *Demirəm oynasın ta axşamadək; Gah otursun, gahı-gahı oynasın.* Q.Zakir.

**GAHLI** b a x **büzməli**. *Həmişəki kimi* [Şahbəy] *yenə də lifəli şalvar, qara gahlı arxalıq geymişdi.* Ə.Əbülhəsən.

**GAP** *is. köhn.* Söhbət, danışıq. [Kətxuda:] *Ay oğul, gapınızın ucundan-qulağından eşitdim.* M.Hüseyn. ☐ **Gap etmək** – söhbət etmək, danışmaq. [Zalxa:] *Salaməleyk, Bayram! Kimlə gap edirsən?* M.F.Axundzadə.

**GAPTLAMA** "Gaplamaq"dan *f.is.*

**GAPLAMAQ** *f. köhn.* Söhbət etmək, danışmaq.

**GAVAHIN** *is.* Kotanın, xışın torpaq layını altdan kəsən kəsici hissəsi. *Alı kişi enib, şumdan gavahını çıxarıb xışın qulaqlı kötüyünə çaldı.* S.Rəhimov. [Nəcəfalı:] *Saxlayın, a bala, kotan ilişdi, gavahını qıracaqsınız.* B.Bayramov.

**GAVALI** *is.* Çəyirdəkli girdə, yaxud uzunsov sarı və ya bənövşəyi rəngli meyvə. *Yay fəslində ərik, gavalı dəyirdi.* S.S.Axundov. [Əyyar:] *..Elə ki budaqlar başını əyər, nar, heyva, şaftalı, gavalı dəyər..* A.Şaiq. // Bu meyvənin ağacı, ya kolu. *Dırmaşdım gavalı ağacına.* Qantəmir.

**GAVALILIQ** *is.* Çoxlu gavalı ağacı əkilmiş yer, gavalı bağı. *Bağın bir hissəsi gavalılıqdır.*

**GAVUR** *is.* [*ər.*] 1. Müsəlmanların islam dininə ibadət etməyənlərə verdiyi ad. *Gavurun tənbəli – keşiş, müsəlmanın tənbəli – dərviş.* (Ata. sözü). [Qədir:] *Gavur öldürdüyüm üçün rəisin hörmətinə, xələtinə nail olacağam.* Mir Cəlal. // Söyüş məqamında işlədilir.

**GAVURLUQ** *is.* Müsəlman dininə inanmama; dinsizlik, kafirlik.

**GE** "G" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**GEC** *zərf* Müəyyənləşdirilmiş, qərarlaşdırılmış vaxtdan sonra. *Gec getmək. Gec xəbər tutmaq. Gec hərəkət etmək. Qatar üç saat gec gəldi. O oxumağa gec başlamışdır.* – [Gülçöhrə Əsgərə:] *Bir qədər gec gəlsəydin, özümü öldürmüşdüm.* Ü.Hacıbəyov.

◊ **Gec gəldi, tez öyrəndi; gec gəlib, tez öyrənən** – bacarıqlı, zirək, tez uyğunlaşan adam haqqında (adətən mənfi mənada işlənir). [Məhbubə:] *Burada deyiblər ki, gec gəldi, tez öyrəndi.* H.Seyidbəyli.

**gec-gec** *zərf* Hərdənbir, bəzən (*tez-tez* ziddi). [Səməd] *evə gec-gec gələrdi.* Çəmənzəminli. *Mehriban çox gec-gec gülümsünür, gülümsünəndə də üzündəki tənasüb pozulur..* H.Seyidbəyli.

**GECDƏN** *zərf* Adi vaxtdan tez, həmişəkindən əvvəl. *Sabah gecdən çıxmışdım şəhərə, nə gördüm: bir vurhavurdur, bir çalhaçaldır ki, gəl görəsən.* "Mol. Nəsr."

**GECDƏN-GEC** *zərf* Çox gec, lap gec. [Qərənfil xalanın] *gecdən-gec gözünə yuxu getdi.* Ə.Vəliyev. ..[Yusif] *gecdən-gec dilləndi: – Dedi-qodu yaymaq Qaradonlunun köhnə peşəsidi.* İ.Hüseynov.

**GECDƏYƏN** b a x **gecyetişən**.

**GECƏ** *is.* 1. Günün günbatandan günçıxana qədər, axşamdan səhərə qədər olan hissəsi. *Gecə vaxtı. – Gecənin xeyrindən sabahın şəri yaxşıdır.* (Ata. sözü). *Qədəm basıb bizə gəlsin nagahi; Bir gecə mən onu mehman eylərəm.* M.P.Vaqif. *Gecədən üç-dörd saat keçmişdi.* C.Məmmədquluzadə.
☐ **Gecə boyu** – bütün gecəni. **Gecə gözü** – gecə vaxtı, gecənin qaranlığında, gecə. [Gülnaz:] *Ata, bu gecə gözü hara?..* M.İbrahimov. **Gecə keçmək** – gecənin gec vaxtı olmaq, yatmaq vaxtından keçmək. *Münaqişə olacağını hiss edən Qulu saata baxdı: – Gecə keçir, getməliyik, – dedi.* Çəmənzəminli. **Gecə qaralmaq (düşmək)** – gündüz qurtarıb gecə başlanmaq. *Təbibsiz-davasız xəstə neyləsin?! Buludlar oynadı, gecə qaraldı.* S.Vurğun. **Gecədən keçmək** – gecə düşəndən müəyyən müddət keçmək. *Gecədən keçmişdi, üfüqlər qara; Sanasan kainat çəkilir dara.* S.Vurğun. **Gecəyə düşmək** – gecə yol getməyə və ya çöldə qalmağa məcbur olmaq, gecələmək üçün yaşayış yerinə çata bilməmək. *Gecəyə düşəcəyik, hələ azı üç saatlıq yolumuz qalıb..* İ.Əfəndiyev.

2. Müəyyən ictimai, siyasi, ədəbi məsələlərə, görkəmli şəxsiyyətlərin xatirəsinə həsr olunmuş axşam yığıncağı. *Füzuli gecəsi. Ədəbi gecə. Gənclər gecəsi. // dan.* Axşam keçirilən müsamirə, konsert.

3. Gecə evdə geyilən, gecələr istifadə edilən. *Gecə papağı. Gecə köynəyi.*

4. Gecə fəaliyyət göstərən, gecə işləyən, gecə olan. *Gecə qatarı. Gecə sanatoriyası. – ..Bakının "Nicat" cəmiyyətinə həsəd aparırlar ki, orada müntəzəm gecə kursları var.* C.Məmmədquluzadə. *Gündüz məktəbindən gecə məktəbinə keçdik.* Q.İlkin.

◊ **Gecə kəsmək** – adətən toy gecələrində səhərə qədər yatmayıb şənlik etmək. *Gündüz niyə yatırsan, gecə kəsməmisən ki?* **Gecə qara, cücə qara** – "xəlvətdir", "gizlidir", "kimsə görmür" mənasında. **Gecəni gündüzə qatmaq** – çox işləmək, həddindən artıq çalışmaq, gecə də, gündüz də işləmək. *Mən ki hər gecəni qatdım gündüzə; Üfüqdə sönməsin ulduzum, Ayım!* S.Vurğun. *Xoşdur bizə, xoşdur gecəni gündüzə qatmaq; Qurmaq və yaratmaq!* S.Rüstəm. **Gecənin bir aləmi (vaxtı) –** gecədən xeyli keçəndən sonra, gecə yarısından sonra. *Gecənin bir vaxtı bir də yuxuda gördü ki, bir dişi laxlayıb, ağzı qan ilə doldu.* "Koroğlu". *Gecənin bir aləmi; Yarıqaranlıq otaq; Açdım gözlərimi*. R.Rza.

**GECƏBƏGÜNDÜZ** *dan.* b a x **gecə-gündüz**. *Gecəbəgündüz işləmək. – Bir ay gecəbəgündüz; O qırpmadı gözünü.* B.Vahabzadə.

**GECƏBƏNÖVŞƏSİ** *is. bot.* Yeraltı kök yumruları olan yabanı bəzək bitkisi; gecəçiçəyi.

**GECƏÇIRAĞI** *is. zool.* Gecələr parıldayıb işıq verən böcək; işıldaquş.

**GECƏÇİÇƏYİ** b a x **gecəbənövşəsi**.

**GECƏ-GÜNDÜZ** 1. *is.* Gecə-gündüzün davam etdiyi 24 saat müddət. *Nə qədər gecə-gündüz; Bu sayaq gəlib keçmiş.* R.Rza.

2. *zərf* Daim, həmişə; bütün günü və gecəni, vaxt bilmədən. *Gecə-gündüz işləmək. Gecə-gündüz çalışmaq. – Sənsiz füzun olur gecə-gündüz fəlakətim; Səbrim tükəndi, yox qəmi-hicranə taqətim.* H.Cavid. [Nadir] *yorulmaq bilməyib gecə-gündüz buruqların üstündə duraraq sərəncam verərdi.* B.Talıblı. [Mərcanov:] *Gecə-gündüz vaxt-bivaxt çalışırlar.* H.Nəzərli.

3. *is. dan. köhn.* Keçmişdə qadın paltarı tikilən bir ipək parçanın adı. *Gecə-gündüzdən paltar geymək.*

◊ **Gecəsi-gündüzü olmamaq** – gecə-gündüz bilmədən işləmək, çalışmaq rahatlıq bilməmək. *Tağlar məhsul tökəndə, kişinin gecəsi-gündüzü olmaz*(*dı*).. Mir Cəlal.

**GECƏ-GÜNDÜZLÜ** b a x **gecəli-gündüzlü**.

**GECƏ-GÜNDÜZLÜK** *sif.* Adətən saylarla: **bir gecə-gündüzlük** – bir gecə-gündüz müddətində olan, bir gecə-gündüzə bəs edən. *Bir gecə-gündüzlük odun.*

**GECƏKƏSDİ** *is. etnoqr.* Toy gecələri səhərə qədər sürən şənlik mərasimi.

**GECƏKİ** *sif.* Gecə olmuş, gecə baş vermiş. *Gecəki hadisə. Gecəki söhbət. – Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çırağ; Gecəki iqbalı gör, gündüzdəki idbarə bax!* M.V.Vidadi. [Qarı çobanlara:] *Qumru xalçasına baxmağa gəlib, – dedi, – bu gecəki tufandan sonra ürəyi darıxdı..* Ə.Məmmədxanlı.

**GECƏKORLUQ, GECƏKORLUĞU** *is. tib.* Gecələr gözün görmə qabiliyyətinin azalmasından ibarət göz qüsuru; şəbkorluq.

**GECƏKORU** *is.* Gecəkorluğu olan adam; şəbkor.

**GECƏQONAĞI** *is.* 1. Bir gecə qonaq qalan adam. *Gecəqonağı tezdən getdi.*

2. *isteh.* Oğru mənasında. *Milis nəfəri bir neçə tin qaçandan sonra gecə qonaqlarını yaxaladı.* (Qəzetlərdən).

**GECƏQUŞU** *is.* 1. B a x **yarasa** 1-ci mənada. *Çox yeriməyib uşaq yenə durdu, başının üstə bir gecəquşu hərlənib fırlanırdı.* Çəmənzəminli. *Bayquş xaraba, gecəquşu qaranlıq sevən kimi xain adamlar da xəlvəti xoşlarlar.* M.İbrahimov.

2. *məc. zar.* Gecələr az yatan, yuxusu olmayan, yuxusuz adam haqqında. *Uşaq lap gecəquşudur. Sən lap gecəquşusan ki.*

**GECƏLƏMƏ** "Gecələmək"dən *f.is.*

**GECƏLƏMƏK** *f.* Gecəni qalmaq, gecəni keçirmək, bir gecəni yatmaq. *Mehmanxanada gecələmək. Kənddə gecələmək. – Fəqət* [Tellinin] *adamsız, tamamilə xəlvət bir həyətdə yalqız qalıb gecələdiyi olmamışdı.* S.Hüseyn. [Çopo:] *Ev gecələdiyim zindandan daha ağır görünürdü.* Çəmənzəminli. *Birdən-birə mənə elə gəldi ki, mən uzun yolları aşıb gələrək nənəmin nağıllarında eşitdiyim əfsanəvi bir ölkədə gecələmişəm...* Ə.Məmmədxanlı.

**GECƏLİK** *is.* 1. Adətən saylarla işlənərək bir şeyin neçə gecəyə kifayət edəcəyini, neçə gecəyə çatacağını, neçə gecədə görüləcəyini bildirir. *İki gecəlik odun. Bir gecəlik işim qalıb. – Bir gecəlik mətləbin bir sənə mabədi var.* (Ata. sözü). *Bir gecəlik otağında; Olmuşam mehman sənə mən.* Aşıq Musa.

2. Gecə geyilən köynək və s. *Sofiya o qədər ağladı ki, gecəliyinin döşü tamam islandı.* Çəmənzəminli.

◊ **On dörd gecəlik ay** – 1) bədirlənmiş, bütöv ay; bədir. *On dörd gecəlik ayın gümüş nuru bir-birinə qısılıb yatan üsyançıların üstünü yorğan kimi örtmüşdü.* P.Makulu; 2) *şair.* gözəl qız (bəzən "kimi" qoşması ilə birlikdə işlənir). *Gəlin on dörd gecəlik ay kimidir.*

**GECƏLİ-GÜNDÜZLÜ** *zərf* Gecə və gündüz, daim. *Gecəli-gündüzlü işləmək. – Şərəfoğlu özü xahiş edib* [Rüstəmi] *hissəsinə keçirdi, iki il gecəli-gündüzlü bir yerdə oldular.* M.İbrahimov. *Buna görə də kombaynçılar şirin yuxularına xələl qataraq, gecəli-gündüzlü sükanın dalından çəkilmirdilər.* Q.İlkin.

**GECƏRİYƏN** *sif. xüs.* Əriməsi çətin olan, çətin əriyən, tez əriməyən. *Gecəriyən metallar.*

**GECƏVƏR** *is. bot.* Çoxillik kökümsovlu dərman bitkisi.

**GECƏYARI(SI)** *zərf* Gecə saat 12-də, gecənin tən yarısında. *Qazan xan bir ovuc bəylə gecəyarısı sərhəd çayının sahilinə çatıb atını suya vurdu.* M.Rzaquluzadə. *Birinci gün gecəyarı; Qurd qısnadı qoyunları.* M.Dilbazi.

**GECİKDİRİLMƏ** "Gecikdirilmək"dən *f.is.*

**GECİKDİRİLMƏK** *məch.* Vaxtında görülməmək, yubadılmaq, ləngidilmək. *Döl vaxtında keçirilir, yun qırxımı gecikdirilmir.* Ə.Vəliyev.

**GECİKDİRMƏ** "Gecikdirmək"dən *f.is.*

**GECİKDİRMƏK** *f.* Bir işi lazımi vaxtında görməmək, yubatmaq, ləngitmək. [Həkimülmülk:] *..Mənim anladığıma görə əlahəzrət mütləq* [Səlimi] *məhv edəcəkdir. Lakin gecikdirməyinə səbəb bəzi sirləri aşkara çıxarmaq istəməsidir.* M.İbrahimov.

**GECİKMƏ** "Gecikmək"dən *f.is. Fərrux kişinin gecikməsi Natiqin xoşuna gəlmədi.* B.Bayramov.

**GECİKMƏK** *f.* 1. Vaxtında gəlməmək, vaxtından gec gəlmək; yubanmaq, gec çatmaq. *Müsamirəyə gecikmək. Dərsə gecikmək. Qatar iki saat gecikdi.* – [Lətifə] *heç vaxt beş-on dəqiqədən artıq gecikməzdi.* M.Hüseyn. *Gəmi gecikən zamanlarda yükdaşıyanlar və işçilər körpüdəki talvarın altına toplaşırdılar.* Q.İlkin. *Əgər Şahmar bu gün çıxmasa, həm Nərminədən əli üzüləcək, həm də imtahanlara gecikəcəkdi.* B.Bayramov.

2. Vaxtında olmamaq, ləngimək, təxirə düşmək. *Qış gecikdi. – Ancaq Nazlı .. Çimnazın dediyinə əməl etməkdə gecikirdi.* Ə.Əbülhəsən. *Bahar gecikirdi, havalar tez-tez dəyişirdi.* S.Vəliyev.

**GECQAYNAYAN** *sif. xüs.* Qaynaması uzun çəkən, tez qaynamayan (mayelər haqqında).

**GECLİK** *is.* Gec olma, vaxtında və ya tez olmama (*tezlik* ziddi).

**GEC-TEZ** *zərf* Tez olmasa da, mütləq bir vaxt olacaq, bir gün, nə vaxt olursa olsun; labüddən. *Gec-tez rastlaşmaq. – Düşmənlə gec-tez qarşı-qarşıya gəlmək, məsələni həll etmək lazımdır.* M.S.Ordubadi. [Anam] *gec-tez* [toyuqlara] *bir bəla yetişəcəyini bilirdi.* A.Şaiq. ☐ **Geci-tezi olmaq** – bir işin, hadisənin və s. tez və ya mütləq baş verəcəyini bildirir. *İşin geci-tezi var.*

**GECYETİŞƏN** *sif.* O birilərindən daha gec yetişən, daha gec dəyən, gecdəyən. *Gecyetişən meyvə. Gecyetişən buğda.*

**GEDƏCƏK** *zərf* Gedilməsi lazım olan; getməli, gediləsi. *Allahdan gizlin deyil, sizdən nə gizlin. Mənim bir gedəcək yerim var.* Çəmənzəminli.

**GEDƏLİ** *zərf* Gedəndən bəri, gedəndən bu vaxta kimi, getdikdən sonra. *Canım gedəli bəsi zamandır; Cismimdəki indi özgə candır.* Füzuli. *Gedəli sən, yıxıldı könül evi; Xərab olur, bəli, ev kətxudasız.* Kişvəri.

**GEDƏN-GƏLƏN** *is.* Yoldan ötən hər bir şəxs, hər kəs, hər adam. [Arvad] *gedəndən-gələndən ərini soruşurdu.* Mir Cəlal.

**GEDƏNİ** *dan.* b a x **gedəli**. *Gülsabah bu evdən gedəni Bayramın otaqlarındakı səliqə tamam pozulmuşdu.* Ə.Vəliyev.

**GEDƏR-GƏLMƏZ** *is.* Qayıtması mümkün olmayan yer; ölüm. *Vücudu iki qara qəpiyə dəyməz, amma gül təki oğlanları dalbadal ləkələyib, bir-bir gedər-gəlməzə yolladılar.* M.Hüseyn. [Nəbi:] *Bu qoca aynalı gəlməsin gözə; Çoxunu göndərdi gedər-gəlməzə.* S.Rüstəm. // Məc. mənada. *Cavan gəlin, dul gəlin; Ollam sənə qul, gəlin; Bu yol gedər-gəlməzdir; Gəl, gözlərəm yol, gəlin.* (Bayatı). [Murtuz:] *O dağın döşündə bir mağara var. Adına gedər-gəlməz deyərlər.* Q.İlkin. // *məc.* Sürgün mənasında. *İş kəsib, ömürlük göndərdilər gedər-gəlməzə.* Ə.Sadıq.

**GEDƏRGİ** *sif.* Mütləq getməli olan, qala bilməyən. *Gedərgi adam. – Arazam, Kürə bəndəm; Bülbüləm, gülə bəndəm*; *Mən gedərgi qonağam; Bir şirin dilə bəndəm.* (Bayatı). *Aşıq mənəm, qalalar; Bürcsüz olmaz qalalar; Çünki gedərgi olduq; Sağlıq ilə qalalar.* Sarı Aşıq. // Müvəqqəti, daimi olmayan. *Həqiqət eşqilə gəldik cahana; Onun hökmüylə də gedərgiyik biz.* S.Vurğun.

**GEDƏRİ** b a x **gedərgi**. *Gedəri qonaq. Qız gedəridir. – Bir gün gedəri olsam; bəlkə azalacaqdır; bu dünyadan bir damla.* R.Rza.

**GEDİB-GƏLMƏ** "Gedib-gəlmək"dən *f.is.*

**GEDİB-GƏLMƏK** *f.* 1. Bir yerdən başqa yerə hərəkət etmək (bir istiqamətdə olan hərəkətin təkrar etdiyini və müxtəlif vaxtlarda cərəyan etdiyini göstərir). *Bu otağa keçən adam həyətdən gedib-gələ bilərdi.* S.Hüseyn. *Sərxan tez-tez qəza mərkəzinə gedib-gəlirdi.* M.Hüseyn.

2. *məc.* Əlaqəsini, dostluğunu davam etdirmək. *Daha onlara gedib-gəlmir.*

3. *məc.* Ölüb-dirilmək. *Hər adam neçə kərə dirili, dünyaya gəlib; Bu gedib-gəlməyin olmazmı məgər payanı?* S.Ə.Şirvani.

**GEDİLƏSİ** bax **gedəcək**. *Gediləsi yer.* [Cahandar ağa:] *..Qapısına gediləsi deyil ki, beş-on adam yığıb aparasan, el adətincə barışıqlıq eləyəsən.* İ.Şıxlı.

**GEDİLMƏ** "Gedilmək"dən *f.is.*

**GEDİLMƏK** "Getmək"dən *məch. Suraxanıyadək Sabunçu dəmir yolu xətti ilə, ondan o yana faytonla gedilirdi.* S.Hüseyn.

**GEDİŞ** *is.* 1. Getmə işi; getmə. *Gəlişin istər aşiq; Heç istəməz gedişin.* Sarı Aşıq. [Uluq bəy:] *Gedişi köksümə çəkir odlu dağ; Görüşü qəlbimdə yandırır çırağ.* A.Şaiq. *Kazım fəqət xəbərsizdi bu işdən; Xəbərsizdi bu uğurlu gedişdən.* M.Müşfiq. // Getmə (yerimə) tərzi. *Bu gedişlə axşama ancaq çata bilər.*

2. *məc.* Bir işin, hadisənin inkişafı, cərəyanı. *Hadisələrin gedişi. Xəstəliyin gedişi. Mübarizənin gedişi. – Lakin həyatın gedişi Fərmanın düşündüyü kimi olmadı.* Ə.Sadıq. *Kimsədə yoxdur günah, dünyanın gedişi bu; Mənim də ilk eşqimin fırtınalı qışı bu..* A.İldırım.

3. *idm.* Kart, şahmat, dama və s. oyunlarda oyunçunun növbəti çıxışı. *Növbəti gediş. Bir neçə gedişdən sonra oyun təxirə salındı. İkinci gedişdə oyunu uduzdu.*

**GEDİŞ-GƏLİŞ** *is.* 1. Müxtəlif istiqamətdə hərəkət etmə, gedib-gəlmə. *Gediş-gəliş azalmışdı. – Gediş-gəliş çox az idi.* S.Hüseyn. *Artıq qaş qaralırdı. Küçələrdə gediş-gəliş azalırdı.* S.Vəliyev. *Dumana görə yolda gediş-gəliş də kəsilmişdi.* B.Bayramov.

2. *məc.* Münasibət, əlaqə. *Qonşu ilə gediş-gəlişi kəsmək. – ..Müsəlman içində əgər birinin bir böyük ilə münasibəti, gediş-gəlişi və dostluğu olmadı, onu saymırlar..* C.Məmmədquluzadə.

3. *məc.* Canlanma, səs-küy, hərəkət. [Çopo:] *Həyətdə bir gediş-gəliş vardı.* Çəmənzəminli.

**GEN**[1] 1. *sif.* Geniş, enli. *Gen otaq. Gen paltar. – Sıra dağlar, gen dərələr; Ürək açan mənzərələr*. S.Vurğun. *Ağca qarı, başını oğlunun gen sinəsinə söykəyib mürgüləyirdi.* Ə.Əbülhəsən.

2. *zərf* Uzaq, kənar, aralı. *Gen qaçmaq. Gen gəzmək. – Dost dost ilə tən gərək*; *Tən olmasa, gen gərək.* (Ata. sözü). *Bəhanə quruban bizdən gen gəzmə; Bir sözün yadlara deyən deyiləm.* M.P.Vaqif. // Eyni mənada bəzən **gendən** şəklində. *Nə üz ilə əl çəkməyəm vətəndən; Biganələr kimi baxıram gendən.* Q.Zakir. *Ovçu gendən yayındı; Oxu məndən yayındı; Bir dəfə kirpik çaldım; Gözüm səndən yayındı.* (Bayatı).

3. *sif.* və *zərf* Olduqca enli, gen-bol, dar olmayan, bədəni sıxmayan. *Gen köynək. Gen corab.* – [Hacı Saleh:] *Amma, ağa, mintənənin ölçüsü məlum olsa idi, çox yaxşı olardı. Orda tikdirrəm, bəlkə dar oldu..* M.F.Axundzadə. [Tahirin] *pencəyi təzə dəbdə, uzun və gen tikilmişdi.* M.Hüseyn. *Rüstəm kişiyə elə gəldi ki, Qoşatxanın əynindəki kostyum gendir..* M.İbrahimov.

4. *is. dan.* Küsülü olma, arası olmama, arası soyuq olma. *Biz genik. Aramız gendir.*

◊ **Gen dünya** – böyük, geniş, ucsuz-bucaqsız yer və s. haqqında. *Ey nazənin, bu gen, geniş dünyada; Namusu əğyarə satmaq nədəndir?* Qurbani. [Aslan:] *Ay ata, bu gen dünyada məgər yer qəhət idi ki, bizim babalar gəlib, bu çılpaq qayaların arasında kənd salıb?* M.Rzaquluzadə. **Gen dünya (başına) dar olmaq** – bax **dünya**. *Gen dünya başıma dar gəlir mənim; Sanki baharıma qar gəlir mənim.* M.Müşfiq. **Gen gün** – rahat, sakit, yaxşı gün, həyat. *Dedi*: *– Əsirgəməm bir qaşıq qanı; Vəli laf vuranlar gen gündə hanı?* Q.Zakir. *Gen gündə dost deyər, dar gündə qaçar. Axtarar girməyə, aya, dam indi.* Aşıq Şəmşir. **Gen yerini dar etmək** – bax **yerini dar eləmək (etmək)** ("**yer**"də). **Gendən-genə** – uzaqdan-uzağa. *Həmid gendən-genə sevmiş olduğu bu qızın gülüşlərindən çox mütəəssir olurdu.* Ə.Məmmədxanlı. **Ürəyini gen saxlamaq** – bax **ürək**.

**GEN**[2] [*yun.* genos – mənşə] İrsiyyətin, orqanizmin bu və ya başqa əlamətinin nəsillərə keçməsini təmin edən maddi əsası.

**GENBALAQ(LI)** *sif.* Balaqları gen, enli olan. *Genbalaq şalvar.* – [Molla Qasımın] *ayağında genbalaqlı ağ kətandan lifəli yalınqat tumanı var idi.* H.Sarabski.

**GEN-BOL** *sif.* 1. Çox geniş, çox böyük, rahat. *Gen-bol yer. Gen-bol ev. – Ağalıq evi təzə qayda ilə tikilmiş, iki mərtəbə gen-bol bir imarət idi.* S.S.Axundov. *Otaq çox genboldu, həyətə və balkona açılan qapıları vardır.* Ə.Vəliyev.

2. Bax **gen**[1] 1-ci mənada. *Gen-bol paltar. – Dursun .. gen-bol çit donunu geydi.* Ə.Əbülhəsən.

3. *məc.* Yaxşı, firavan, ehtiyacsız, rifah içində. *Gen-bol* (z.) *yaşamaq. Gen-bol həyat.*

**GEN-BOLLUQ** *is.* Firavanlıq, rifah, bolluq. *Gen-bolluq içində yaşamaq.*

**GENDƏDUR** *is. köhn.* Parıltılı və şax parça növü. // Həmin parçadan tikilmiş. *Gendədur tuman.*

**GENDÖŞLÜ** *sif.* Döşü, sinəsi enli, gen olan; geniş sinəli. *Gendöşlü at.*

**GENDÖŞLÜLÜK** *is.* Döşün, sinənin genliyi.

**GENEALÓGİYA** [*yun.* genealogia – şəcərə] 1. Şəcərənin, nəslin tarixini öyrənən köməkçi tarix elmi.

2. Şəcərə, nəsil tarixi.

**GENEALOJÍ** [*yun.*] Genealogiyaya aid olan, genealogiya ilə əlaqədar olan. *Genealoji tədqiqat. Dillərin genealoji təsnifatı.*

**GENERÁL** [*lat.* generalis – ümumi, baş] Yüksək komanda heyəti üçün hərbi rütbə, habelə bu cür rütbəsi olan şəxs. □ **General-mayor** – rütbəcə birinci general adı. **General-leytenant** – rütbəcə ikinci general adı. **General-polkovnik** – rütbəcə üçüncü general adı. **Ordu generalı** – ən yüksək general adı.

**GENERÁLİSSİMUS** [*lat.* generalissimus – ən baş] Ən yüksək hərbi rütbə, habelə həmin rütbəni daşıyan şəxs.

**GENERALİTÉT** [*alm.* əsli *lat.*] Ordunun ali komanda heyəti; generallar.

**GENERÁL-QUBERNÁTOR** [*lat.*] 1917-ci il inqilabından əvvəl Rusiyada və bəzi ölkələrdə: bir və ya bir neçə quberniyanın yüksək hərbi-inzibati hüquqlara malik rəisi. [Nəbi:] *Min atlı göndərib dağlara sarı; Tiflisin general-qubernatoru.* S.Rüstəm. *Biz İran əyalətlərindən birisində general-qubernatorla söhbət edərkən o, əyalət haqqında bizim təəssüratımızı soruşdu.* M.İbrahimov.

**GENERAL-QUBERNATORLUQ** *is.* 1. General-qubernator vəzifəsi. *Camaat ona* [Xudadat bəyə] *Gəncə general-qubernatorluğunu təklif edəndə uzun müddət razı olmamış, "mən hakiməm" – demişdi.* İ.Şıxlı.

2. 1917-ci il inqilabından əvvəl Rusiyada: general-qubernatorun idarə etdiyi inzibati-ərazi vahidi.

**GENERALLIQ** *is.* General rütbəsi, adı.

**GENERÁSİYA** [*lat.* generatio – törəmə] *xüs.* 1. Heyvanların, bitkilərin, mineralların bütün üzvləri; nəsil.

2. Törəniş, törənmə, yenidən yaranma. *Elektrik enerjisinin generasiyası.*

**GENERÁTOR** [*lat.*] *xüs.* 1. Mexaniki enerjini elektrik enerjisinə çevirən maşın.

2. Generasiya (2-ci mənada) hasil etmək üçün işlədilən müxtəlif cihazların, qurğuların adı. *Siqnal generatoru.*

3. Bax **qaz(o)generator**.

◊ **Generator qazı** – bərk yanacağı qazlaşdırmaq yolu ilə alınan qaz.

**GENERATORLU** *sif.* Generatoru olan. *Generatorlu lampa.*

**GENETÍK** *sif.* [*lat.*] 1. Genezisə aid olan, bir şeyin mənşəyini, inkişafını öyrənən. *Genetik üsul. Genetik əlaqə.*

2. Genetikaya aid olan, genetika ilə əlaqədar olan.

**GENÉTİK** [*yun.*] Genetika mütəxəssisi, genetika alimi.

**GENÉTİKA** [*yun.*] Biologiyanın, orqanizmlərin irsiyyətini və dəyişkənliyini öyrənən bəhsi.

**GÉNEZİS** [*yun.*] *kit.* Mənşə, törəniş; əmələgəlmə prosesi.

**GENƏ** *dan.* bax **yenə**. *Bilmənəm ki, sənə nə demiş əğyar*; *Xəyalındır məndən genə gen kimi.* M.P.Vaqif. *Ələsgər eşqə düşüb*; *Sevdi cəfakarı genə.* Aşıq Ələsgər. *Əziziyəm, genə sən; Səfa gəldin genə sən; Fikrim, zikrim, xəyalım; Sənsən, sənsən, genə sən.* (Bayatı).

**GENƏLDİCİ** *is.* Bir şeyi genəltmək üçün işlədilən alət, qurğu və s. // Eyni mənada dərman və s. haqqında. *Damarları genəldici dərman.*

**GENƏLDİLMƏ** "Genəldilmək"dən *f.is.*

**GENƏLDİLMƏK** *məch.* Gen hala salınmaq, eninə artırılmaq, gen edilmək, enliləşdirilmək.

**GENƏLMƏ** "Genəlmək"dən *f.is. Damarların genəlməsi*.

**GENƏLMƏK** *f.* 1. Gen hala düşmək, eninə böyümək, enliləşmək, genləşmək. *Jaket çox geyildiyindən genəlib. Ayaqqabı genəldi.*

2. Gen şəkil almaq, gen olmaq, daha da enliləşmək. *Aşağıdan dar, yuxarı getdikcə genələn və hər iki tərəfdən qulpu olan qazan partizanların həmişə karına gəlmişdi.* S.Vəliyev.

3. *məc.* Genişlənmək, böyümək. *Hər gün genəldi daireyi-hörmətin sənin; El uğradıqca fəqrə, şişib sərvətin sənin.* M.Ə.Sabir. [Mirzə Mehrəli] *otağı dolandıqca xəyal meydanı genəldi.* Çəmənzəminli. *Birləşib artdıqca qabarlı əllər; Daha da genəlir sözün meydanı.* H.Arif.

4. Dərman və s. təsirilə enlənmək, genişlənmək. *Qan damarları genəldi. Dərmandan göz bəbəkləri genəlmişdir.*

**GENƏLTDİRMƏ** "Genəltdirmək"dən *f.is.*

**GENƏLTDİRMƏK** "Genəltmək"dən *icb. Paltosunu dərziyə verib genəltdirmək.*

**GENƏLTMƏ** "Genəltmək"dən *f.is.*

**GENƏLTMƏK** *f.* 1. Gen etmək, eninə böyütmək, gen hala salmaq. *Paltarı genəltmək. Şalvarın belini genəltmək.* // Geyib böyütmək, enlətmək. *Cemperi geyib genəltmək.* // Dərman və s. təsiri ilə genişlətmək, enlətmək. *İynə vurub damarları genəltmək. Gözünə damcı töküb bəbəyi genəltmək.*

2. Genişləndirmək, açmaq, böyütmək, gen etmək. *Oynamaq üçün yeri genəltmək.*

**GENİŞ** *sif.* 1. Eni çox olan, gen (*dar* əksi). *Geniş alın. Geniş eyvan. Geniş küçə. Geniş arx.*

2. Sahə etibarilə çox böyük. *Geniş tarla. Geniş çöllər. Geniş düzənlik. – Mil düzü, Mil düzü, geniş Mil düzü! Eşit ürəyimdən gələn bu sözü..* M.Müşfiq. *Qarşısında ucsuz-bucaqsız geniş bir çöl sərilmişdi.* H.Nəzərli. [Ümid] *hökumət evinin qabağındakı .. geniş meydanla Xəzərin sahilinə gəldi.* B.Bayramov. // Məc. mənada. *Kasıbın qapısı da ürəyi kimi geniş olardı.* H.Sarabski. // *məc.* Ucsuz-bucaqsız, sonsuz, nəhayətsiz. *Geniş üfüq. – Görürsən, bu geniş, bu böyük dünya; Hələ çoxlarının başına dardır.* N.Rəfibəyli.

3. Böyük, iri (addım haqqında). [Oğlan] *geniş addımlarla təpəyə çıxdı.* H.Nəzərli. *Aydın geniş addımlarla səhiyyə məntəqəsində gəzişir, .. öz gələcək planlarını düşünüb nizama salmaq istəyirdi.* H.Seyidbəyli.

4. *məc.* Miqyası, qavrama dairəsi, ölçüsü böyük. *Geniş ticarət. Geniş vəsait. Geniş imkanlar.*

5. *məc.* Hamını, yaxud çoxunu əhatə edən, hamıya yaxud çoxuna şamil olan; kütləvi. *Geniş tamaşaçı kütləsi. Geniş müşavirə. Geniş seçki kampaniyası. Elmi şuranın geniş iclası. – Geniş oxucu kütləsi böyük satiriki "Molla Nəsrəddin" adı ilə tanımağa başladı.* M.İbrahimov. // Hamı üçün, çoxları üçün olan. *Geniş istehlak malları.*

6. *məc.* Azad, sərbəst, heç bir şeylə məhdudlaşdırılmayan. *Geniş həyat.*

7. *məc.* Dərin, əsaslı, məhdudluqdan azad, ətraflı. *Həyata geniş* (z.) *baxmaq. Sözü geniş mənada başa düşmək lazımdır.*

**geniş-geniş** 1) *zərf* Geniş, geniş surətdə. *Kərim baba iri sallaq dodaqlarını geniş-geniş açaraq gözlərini daha da qıydı.* A.Şaiq; 2) *sif.* Geniş (çoxluq bildirir). *Geniş-geniş tarlalar. Geniş-geniş meydanlar. – Bu nəğmələr dərin-dərin; Geniş-geniş ürəklərin; Səmimiyyət nəğməsidir.* M.Müşfiq.

**GENİŞALINLI** *sif.* Alnı geniş olan, enli olan. *Genişalınlı kişi.*

**GENİŞEKRANLI** *sif.* Ekranı geniş olan. *Genişekranlı kinoteatr.* // Geniş ekran üçün olan. *Genişekranlı film.*

**GENİŞKÖKSLÜ** *sif.* Köksü enli olan; genişsinəli. *Genişkökslü gənc. – Məmməd bəy on iki-on üç yaşında, alagözlü, qumral saçlı, genişkökslü, şümal bir oğlandı.* Çəmənzəminli. *Kərim baba .. genişkökslü bir qoca idi.* A.Şaiq.

**GENİŞQƏLBLİ** *sif.* Ürəyi, qəlbi geniş olan; ürəyiaçıq, açıqürəkli, comərd, səmimi. *Genişqəlbli adam. –* [Xədicə] *olduqca xoşsöhbət, eyi təbiətli, genişqəlbli, munis və mehriban bir qız idi.* S.Hüseyn.

**GENİŞQƏLB(Lİ)LİK** *is.* Genişqəlbli adamın keyfiyyəti; ürəyiaçıqlıq, açıqürəklilik, comərdlik, səmimilik.

**GENİŞLƏDİLMƏ** "Genişlədilmək"dən *f.is.*

**GENİŞLƏDİLMƏK** b a x **genişləndirilmək**.

**GENİŞLƏNDİRİCİ** *sif. xüs.* Geninə böyüdən, enlədən, genişləndirən. *Yeni kəşfiyyat quyusu turbin-rotor üsulu ilə, 12 düyməli və genişləndirici baltalarla qazılacaqdır.* (Qəzetlərdən).

**GENİŞLƏNDİRİLMƏ** "Genişləndirilmək"dən *f.is. Hüquqların genişləndirilməsi.*

**GENİŞLƏNDİRİLMƏK** *məch.* 1. Geniş hala salınmaq, daha geniş edilmək. *Yol genişləndirildi. Əkin sahəsi xeyli genişləndirilmişdir.*

2. Böyüdülmək, artırılmaq. *Ticarət şəbəkəsi genişləndirilmişdir.*

**GENİŞLƏNDİRMƏ** "Genişləndirmək"-dən *f.is.*

**GENİŞLƏNDİRMƏK** *f.* 1. Genəltmək, eninə daha da böyütmək. *Yolu genişləndirmək. Hüdudları genişləndirmək. – Yazda güclü sel gəldiyindən çay daşmış, yatağını xeyli genişləndirmişdi.* Ə.Vəliyev.

2. Sayca artırmaq, böyütmək, daha da artırmaq, inkişaf etdirmək. *Ticarəti genişləndirmək. Tibb məntəqələri şəbəkəsini genişləndirmək.*

3. *məc.* Gücləndirmək, artırmaq. [Əhməd istəyirdi ki] *..asan bir yol ilə öz mayasını böyüdüb alverini genişləndirsin və kasıblıqda çəkdiyi əziyyətdən xilas olsun.* B.Talıblı. [Alverçilər] *başqa şəhərlərə, xüsusən Orta Asiyaya gedir, .. alverlərini genişləndirirdilər.* Ə.Əbülhəsən.

4. *məc.* Daha da kütləvi etmək, geniş kütləni əhatə etmək. *Hərəkatı genişləndirmək.*

5. *məc.* Artırmaq, dərinləşdirmək, daha geniş etmək. *Nüfuz dairəsini genişləndirmək. Biliyini genişləndirmək. Təcrübəni genişləndirmək.*

**GENİŞLƏNMƏ** "Genişlənmək"dən *f.is.*

**GENİŞLƏNMƏK** *f.* 1. Daha geniş olmaq, genəlmək, böyümək. [Şiraslan] *..çaylar arası ilə genişlənib yayılan düzənləri görürdü.* S.Rəhimov. *Anbardan ağ, dolu torbalar azalır, yer genişlənirdi.* Mir Cəlal. *Göz bəbəkləri ixtiyarsız olaraq genişləndi.* H.Seyidbəyli.

2. *məc.* Artmaq, daha geniş meydan almaq, ətrafa yayılmaq. *Üfüqdə başlanan işıq getdikcə genişlənirdi.* S.Rəhimov. // *məc.* Daha kütləvi bir şəkil almaq, geniş kütlə arasında yayılmaq. *İxtiraçılıq işi genişlənib.*

**GENİŞLƏTDİRMƏ** "Genişlətdirmək"-dən *f.is.*

**GENİŞLƏTDİRMƏK** b a x **genişlətmək**.

**GENİŞLƏTMƏ** "Genişlətmək"dən *f.is.*

**GENİŞLƏTMƏK** b a x **genişləndirmək**.

**GENİŞLİK** *is.* 1. Geniş şeyin halı, geniş olma. *Yerin genişliyi. Meydanın genişliyi.*

2. Açıqlıq, düz yer. *Küçə genişliyə çıxır.*

3. *məc.* Azadlıq, sərbəstlik. [Züleyxanın] *qəlbi genişlik istədiyi halda, özü dar gölməçələrdə çapalamalı olmuşdur.* M.İbrahimov. [İmran:] *Əlbəttə, indi mən lazım olmaram. Ağzınız genişliyə çıxıb.* İ.Şıxlı. // *məc.* Açıqlıq, geniş fəza mənasında. *Tərlan genişlik sevər; Göylərdir onun yeri.* R.Rza. *Baxıram üfüqün genişliyinə; Soyuq baxışları unutmaq üçün.* B.Vahabzadə.

4. *məc.* Hərtərəflilik, dərinlik. *Görüş dairəsinin genişliyi. Məlumatın genişliyi.*

**GENİŞÜRƏKLİ** b a x **genişqəlbli**. *Genişürəkli adam. – Züleyxa xala genişürəkli, səxavətli bir qadındır.* M.Dilbazi.

**GENİŞHƏCMLİ** *sif.* Həcmi geniş olan; irihəcmli.

**GENİŞCƏ** *sif.* Bir qədər geniş, azca geniş. *Genişcə otaq.* // Çox geniş, olduqca geniş. *Genişcə bir çöl ki, dənizdən kənar; Günəşin altında od tutub yanar.* S.Vurğun.

**GENKÜRƏK(Lİ)** *sif.* Kürəyi gen olan; enlikürək(li). *Genkürək oğlan.*

**GENLİK** *is.* Gen şeyin halı; genişlik.

**GENOSİD** [*yun.* genos və *lat.* caedere-dən "nəsli, tayfanı məhv etmə"] İrqi, milli və ya dini səbəblərə görə əhalinin ayrı-ayrı qruplarının məhv edilməsi. *Genosid bəşəriyyətə qarşı ən ağır bir cinayətdir.*

**GENTUMAN(LI)** 1. *sif.* Tumanı gen olan, gen tuman geymiş (qadın haqqında).

2. *İs. mənasında. məc.* Geridə qalmış, avam, cahil, mədəniyyətsiz (qadın haqqında).

**GENCƏ** b a x **genişcə**.

**geo…** [*yun.* ge – yer] Bir sıra xarici sözlərin (isim və sifətlərin) qabağında, onlara yer, Yer kürəsi, yer qabığı mənası verən önlük; məs.: geobotanika, geologiya, geofizika.

**GEOBOTÁNİKA** [*yun.*] Botanikanın, coğrafi mühitdən (torpaq, iqlim xüsusiyyətlərindən və s. amillərdən) asılı olaraq bitki-

lərin Yer kürəsində yayılmasını, tərkib və növ dəyişməsini öyrənən bəhsi.

**GEODÉZİYA** *is.* [*yun.*] Yerin ölçülərini, formasını, qravitasiya sahəsini və səthindəki ölçüləri öyrənən elm sahəsi.

**GEODEZİYAÇI** *is*. Geodeziya mütəxəssisi.

**GEODEZİST** ba x **geodeziyaçı**.

**GEOKİMYA** [*yun.* geo və *ər*. əlkimya] Yerin kimyəvi tərkibi və Yer qabığında kimyəvi elementlərin yayılması və yerdəyişməsi qanunları haqqında elm.

**GEOKİMYƏVİ** [*yun*. geo və *ər*. kimyəvi] Geokimyaya aid olan, geokimya ilə əlaqədar olan. *Geokimyəvi tədqiqat.*

**GEÓLOQ** [*yun*.] Geologiya mütəxəssisi.

**GEOLOJÍ** [*yun*.] *sif.* Geologiyaya aid olan, geologiya ilə əlaqədar olan. *Geoloji xəritə*. // Yerin tarixinə, Yer qabığına aid olan. *Geoloji dövr*. *Geoloji kəşfiyyat* (bir yerdə olan faydalı qazıntıları öyrənmək məqsədilə aparılan geoloji tədqiqat, axtarış).

**GEOLOGİYA** [*yun.*] Yerin quruluşu, tərkibi, tarixi, yerdə üzvi həyatın tarixi və faydalı qazıntıların yerdəyişməsi haqqında elm.

**GEOMORFOLOJİ** [*yun.*] *sif.* Geomorfologiyaya aid olan, geomorfologiya ilə əlaqədar olan. *Geomorfoloji tədqiqat.*

**GEOMORFOLÓGİYA** [*yun*.] Fiziki coğrafiyanın, yer səthinin relyefini və onun inkişaf tarixini öyrənən bəhsi.

**GEOFÍZİK** [*yun.*] Geofizika mütəxəssisi.

**GEOFÍZİKA** [*yun.*] Yerin fiziki xüsusiyyəti və onda gedən fiziki proseslər haqqında elmlərin məcmusu.

**GEOFİZİKİ** *sif.* Geofizika ilə əlaqədar olan, geofizikaya aid olan. *Geofiziki tədqiqat üsulları. Geofiziki rəsədxana.*

**GEPARİN** *is.* [*yun.*] *tib.* Qanın axmasının qarşısını alan dərman preparatı.

**GERB** [*pol.* herb, *alm.* erbe – irs] Bir dövlətin, şəhərin, nəslin, silkin və s.-nin bayraq, pul, möhür və s. üzərində təsvir olunan fərqləndirmə nişanı. *Dövlət gerbi haqqında Konstitusiya Qanunu. Azərbaycanın Dövlət gerbi ilə bağlı müsabiqə elan olunmuşdur.* ☐ **Gerb rüsumu** – mülki-hüquqi işlər üzrə sənədləri rəsmiləşdirərkən alınan xüsusi dövlət rüsumu (sənədlərə üzərinə dövlət gerbi şəkli olan müəyyən qiymətdə markalar yapışdırmaqla icra edilir).

**GERÇƏK** 1. *zərf* Doğru, düz, həqiqi. *Zülfünə zülməti-dövran dedilər, gerçək imiş; Ləbinə çeşmeyi-heyvan dedilər, gerçək imiş.* S.Ə.Şirvani. // Həqiqətən, əslində. *Sən ki bir əqrəb imişsən gerçək; Bu zəhərlər, bu tikənlər nə demək?* S.Vurğun. ☐ **Gerçək olmaq, gerçəyə çıxmaq** – həqiqət olmaq, doğru olmaq, düz çıxmaq. *Lidiya bu sözlərin, elə günü sabah gerçəyə çıxacağına qətiyyən inana bilməzdi.* Ə.Əbülhəsən.

2. *sif.* Həqiqi, düz, doğru (*yalan* əksi). *Gerçək söz.* // İs. mənasında. *Gerçəyini demək.*

**GERÇƏKDƏN** *zərf* Doğrudan, ciddi (olaraq). *Gerçəkdən hirslənmək. Gerçəkdən demək.*

**GERÇƏKLƏMƏ** "Gerçəkləmək"dən *f.is.*

**GERÇƏKLƏMƏK** *f.* Həqiqətə çevirmək, bir şeyi doğrudan-doğruya etmək. [Qurban:] *Ay qarı, deyəsən axı, sən gerçəkləyirsən.* Ə.Haqverdiyev. *Cavanşir özünü tamamilə itirdi. "Bu qız deyəsən, lap gerçəklədi" – deyə xəyalından keçirdi.* İ.Şıxlı.

**GERÇƏKLƏNMƏ** "Gerçəklənmək"dən *f.is.*

**GERÇƏKLƏNMƏK** *f.* Gerçək olmaq, düz çıxmaq, həqiqət olmaq. *Bənövşə çiçəkləndi; Yarpağı ləçəkləndi; Yatdığı yalan oldu; Ölümü gerçəkləndi.* (Bayatı).

**GERÇƏKLƏŞMƏ** "Gerçəkləşmək"dən *f.is.*

**GERÇƏKLƏŞMƏK** *f.* Gerçəklənmək, gerçək hala gəlmək, reallaşmaq, həqiqətə çevrilmək. [Oğlan] *..işin gerçəkləşdiyini .. dərk edib, atasının Marala zəng etməyinə mane olmaq istəyirdi.* Ə.Əbülhəsən.

**GERÇƏKLİK** *is.* 1. Həqiqət, həqiqi varlıq, reallıq. *Şüur gerçəkliyi əks etdirir.*

2. Doğruluq, həqiqilik, düz çıxma; ciddilik.

**GERİ** 1. *zərf* Arxa tərəfə, dala, dal tərəfə. [Qaçay] *bir neçə addım gedəndən sonra istədi qanrılıb geri baxsın*. İ.Məlikzadə.

2. *is.* Ard, dal, davam, mabəd. *Şerin gerisini oxumaq. – Toğrul Qətibənin bu sözlərini eşidəndən sonra, rübailərinin gerisini oxumadı, kağızı büküb cibinə qoydu..* M.S.Ordubadi.

3. *is. məc.* Aqibət, son, nəticə. *İşin gerisini düşünmək.* – [Prokuror:] *Bu nədir? Adam bir iş tutanda gerisini fikirləşməz?* İ.Şıxlı.

4. *is. məc.* İnkişaf etməmiş, dala qalmış. *İnkişaf çox zəifdir; Üzrümüz yoxdur əsla; İmkanımız var ikən; Geriyik nə əsasla?* R.Rza.

◊ **Geri durmaq** – uzaqlaşmaq, yaxın gəlməmək. *Yar deyilsən, çək ayağı, geri dur; Canımı odlara yaxmağın nədir?* M.P.Vaqif. **Geri götürmək** – 1) dala almaq verdiyini istəyib almaq. *Kitabını geri götürdü;* 2) *məc.* dediyi sözdən, vədindən dönmək. *Sözünü geri götürmək. – Padşah qızını çox şad görüb, hökmünü geri götürdü.* (Nağıl). **Geri (geriyə, geridə) qalmaq** – 1) dalda, arxada qalmaq. *Qocalar geridə qaldılar. – Komandan əsgərlərdən geri qalmamaq üçün yoluna davam edir.* M.Hüseyn; 2) vaxtını keçirmək, vaxtında etməmək; yubatmaq, ləngitmək. *Dərsim geri qalıb. – Xəstə olduğum cəhətə bu yay xırmanım hamıdan geriyə qalmışdı.* S.S.Axundov; 3) *məc.* inkişafdan qalmaq, tərəqqi etməmək. [Almaz Xanımnaza:] *Ay ana, axı bu bizim kəndimizdir, elimizdir. Belə, geridə qalıblar ey, geridə.* C.Cabbarlı. **Geri qayıtmaq** – dala dönmək, qayıtmaq. *Qayıdıb gələndə məclisdən geri; Yolda iki nəfər düşdü üstümə.* M.Rahim. **Geri qaytarmaq** – 1) qaytarmaq, qovmaq. *Uşağı geri qaytarmaq. – Pəri nənə .. gəlinini qapıdan geri qaytarmaq fikrində deyildi.* M.Hüseyn; 2) ödəmək, vermək. *Borcunu geri qaytarmaq;* 3) *məc.* qarşısını almaq, artmağa, inkişaf etməyə qoymamaq. *Toxtaqlıq, təskinlik bədbəxt hadisəni geri qaytarmır.* Ə.Vəliyev. **Geri oturmaq** – geri çəkilmək. *Yağı geri oturdu.* – [Düşmən] *hər dəfə öz qara qanı içərisində boğulub geri otururdu.* Ə.Məmmədxanlı. **Geri oturtmaq** – zor gələrək geri çəkilməyə, qaçmağa məcbur etmək, dala oturtmaq. *Üsyançılar üzüm bağlarına doluşan və şəhərin ucqar dar küçələriylə irəliləmək istəyən bolşevikləri əzərək geri oturtdular.* İ.Şıxlı. **Geri(də) qoymaq** – dalda buraxmaq, irəliləmək. *Ələmdarlı bizi geridə qoyub özü irəli getdi, daşın dalına sinib dedi*: *– Kimsən, dayan!* Mir Cəlal. **Geri(yə) almaq** – yenidən əldə etmək, almaq, özlərinə qaytarmaq. *Kitabları geri almaq. – ..Osmanlı arvadları bir yerə cəm olub nitqlər söyləyiblər və and içiblər ki, paymal olan hüquq və ixtiyarlarını qanuni-əsasi vasitəsilə geri alsınlar.* C.Məmmədquluzadə. *Verilən ənamı geri almaq gədalıqdır.* C.Cabbarlı. **Geri(yə) atmaq (salmaq)** – 1) dala atmaq, arxaya qatlamaq. *Saçını geri atdı. – Şəmsiyyə qırmızı ipək paltarın ətəklərini geri ataraq kreslodan birisinə oturdu.* M.İbrahimov; 2) *məc.* inkişafını saxlamaq, qarşısını almaq, mane olmaq. *Onlar bilirdi*(*lər*) *ki, burada oturanların məhvi İran inqilabını on illərcə geri ata bilər.* M.S.Ordubadi. **Geri(yə) baxmadan** – üzünü dala çevirmədən, heç bir şeyə fikir vermədən, sürətlə. *Geri baxmadan getmək.* **Geri(yə) çəkilmək** – 1) dayandığı, durduğu yerdən dala çəkilmək, geri addımlamaq. *İki addım geri çəkilmək. Yoldan geri çəkil! – Şeyx Sədra itaət .. ilə geri çəkilir.* H.Cavid. *Müəllim gələn şagirdlərə yol vermək üçün geri çəkildi.* Ə.Əbülhəsən; 2) düşmənin hücumuna davam gətirməyib öz mövqelərini tərk edərək çəkilmək. *Düşmən geri çəkildi. – ..Yarım saat çəkmədi aralıqda beş-on köynək cırıldı və Hürzad tərəf döyülmüş, söyülmüş geri çəkilib evdə qapandılar.* Çəmənzəminli. **Geri(yə) dönmək** – 1) b a x **geri qayıtmaq**. *Gedənlər geri döndülər.* [Şeyx Hadi:] *Çarəsiz biz də Hindi tərk edərək; Geri döndük təəssüf eyləyərək.* H.Cavid. *Mirzə Cavad arvadının səsinə geri dönüb, oğlunun halətini görüb başladı söyləməyə.* Ə.Haqverdiyev; 2) çevrilmək, dala baxmaq, arxaya dönmək. *Əvvəl qışqırıq eşitdim, tez geri döndüm, o dəqiqə iki kölgə harasa yoxa çıxdı.* H.Seyidbəyli. **Geri(yə) getmək** – 1) dala qayıtmaq, geri dönmək; 2) *məc.* arıqlamaq, zəifləmək. *Uşaq günü-gündən geri gedir. – Ağabəy bir gün baxıb gördü, elə qız günü-gündən geri gedir.* (Nağıl). [Sultan bəy:] *Beş ildir ki, günü-gündən geri gedirəm.* Ü.Hacıbəyov; // vəziyyəti getdikcə pisləşmək, ağırlaşmaq; yaxşılaşmamaq (xəstə haqqında). *Xəstə geri gedir.* – [Sona xanım:] *Pəri, heç mənim halımı soruşma, bax, görürsən, gün-gündən*

*geri gedirəm.* Ə.Haqverdiyev. [Böyük oğlu:] *3-4 gün bu dərmanları atdı, kişi daha da geri getdi.* Qantəmir; 3) b a x **geri qalmaq** 3-cü mənada. *Elə bil düşünür Sent-Ekzüperi: – Ağıldan, əməldən geri qaldı səs; Bu qoca dünyamız hara gedir bəs?* B.Vahabzadə. **Geri(yə) istəmək** – tələb etmək, bir şeyi təzədən əldə etməyə çalışmaq. *Borcunu geri istəmək. – Zeynal ötəyə-bəriyə müraciət edib sabiq xidmətini geri istəyirdisə də, müvəffəq olmayırdı.* S.Hüseyn. **Geri(yə) salmaq** – 1) b a x **geriyə çəkmək** 2-ci mənada; 2) *məc.* yubatmaq, təxirə salmaq. *Lətif hələ keçən il Bakıya getməli idi. Lakin bir hadisə onu bir il geri saldı.* H.Seyidbəyli. **Geridən baxmaq** – seyrçi kimi uzaqdan baxmaq, yaxın durmamaq, qarışmamaq, iştirak etməmək, uzaq durmaq. *Geridən baxma, kömək elə. – Ustalardan dərs al hərdən; Xeyrə-şərə baxma geridən.* Aşıq Şəmşir. **Geriyə çəkmək** – 1) arxaya çəkmək, dala vermək, kənara çəkmək. *Maşın gəlir, uşağı geri çək. – Şofer onun qolundan tutub geriyə çəkdi...* M.Hüseyn; 2) *məc.* inkişafına, tərəqqisinə, irəliləməsinə mane olmaq. *Köhnə adətlər xalqı geri çəkir.*

**GERİLƏMƏ** 1. "Geriləmək"dən *f.is.*

2. Gerilik. *Başqa idarələrdən gəlmiş bu teleqramların hamısında "Geriləməni tezliklə ləğv ediniz!" – deyə şəxsən Tərlanı hədələyirdilər.* M.Hüseyn.

**GERİLƏMƏK** *f.* 1. Geri çəkilmək. [Gülsabah:] [Gülər] *qorxdu, o qorxaqcasına gerilədi, döndü, qaçdı.* C.Cabbarlı. *Mehriban* [Zeynalı] *elə halda görüncə qorxub gerilədi.* S.Hüseyn.

2. *məc.* İnkişafdan qalmaq, qabağa getməmək, geri qalmaq, tənəzzül etmək.

3. *məc.* Sözündən dönmək, sözünü danmaq, dediyini yerinə yetirməmək, vədindən qaçmaq. [Namaz:] *Zalxa, get uşaqlara de ki, dəxi cəfa çəkməsinlər, Tarverdi gerilədi.* M.F.Axundzadə.

**GERİLƏTMƏ** "Gerilətmək"dən *f.is.*

**GERİLƏTMƏK** *f.* Geri qalmasına, geri getməsinə səbəb olmaq; geri qoymaq.

**GERİLİK** *is.* Geri olma, geri qalma; inkişafsızlıq, cəhalət. *Ədib* ["Pir" hekayəsində] *bir sıra canlı bədii surətlərdə köhnə feodal Azərbaycanın mənzərəsini məharətlə yaradır, mövhumatın, geriliyin törətdiyi cinayət və fəlakətləri göstərir.* M.Arif. "*Kəşkül*" "*Əkinçi*"*nin yolunu davam etdirərək öz səhifələrində gerilik əleyhinə kəskin məqalələr dərc edirdi.* M.İbrahimov.

**GERMAN** Hind-Avropa dillər ailəsinə mənsub olan dil qruplarından biri.

**GERMANİSTİKA** German dilləri və ədəbiyyatı haqqında elm.

**GERMANİZM** [*lat.*] German dillərindən alınmış söz və ya ifadə.

**GERMETİK** *sif.* Hava keçirməyən, kip.

**GERZE** *is.* Qədim Misirdə qəbiristan.

**GESTÁPO** [*alm.*] Hitler Almaniyasında gizli polis. *İndi isə* [mehmanxana] *faşistlərin gestapo idarəsi idi, .. minlərlə adama burada divan tutulurdu.* S.Vəliyev. *Kəsib hər bərəni, pusub hər yolu; Gestapo dörd gözlə gəzir onları.* B.Vahabzadə.

**GESTAPOÇU** *is.* Gestapoda xidmət edən adam (b a x **gestapo**). *Hər gecə gestapoçular bizim yatdığımız daxmalara gəlirlər..* Ə.Məmmədxanlı. *Kəsilir cığırlar... Gestapoçular; Düşür igidlərin ləpirlərinə.* B.Vahabzadə.

**GET** *is.* Qədim Frakiyada tayfa.

**GETDİKCƏ** *zərf* 1. İrəlilədikcə, irəli hərəkət etdikcə, qabağa doğru gedə-gedə. *Yol getdikcə söhbət etmək. – Maşın getdikcə onun çarxlarının buraxdığı izlər qumun üstündə qalırdı.* H.Seyidbəyli.

2. Uzandıqca. *Dərə qərbə doğru getdikcə qayalıq, dağlıq, iri və oyuq daşlarla dolu qorxunc yerlərdən ibarətdi.* A.Şaiq.

3. *məc.* Tədricən, yavaş-yavaş, zaman keçdikcə. *Getdikcə bu məhəllənin halı fənalaşdı.* N.Nərimanov. *Mirzağanın Cəmiləyə qarşı olan meyli və məhəbbəti getdikcə artırdı.* S.Hüseyn. [Qəhrəman:] *Atəş getdikcə şiddətlənir və vəziyyətin ciddiyyətini andırırdı.* H.Nəzərli.

**GET-GƏL** *is.* Bir yerə çox gedib-gəlmə. [Laçın] *uzun get-gəllərdən usandı..* M.Hüseyn. *Bu get-gəllər bazarına dəvədi dünya..* M.Araz.

◊ **Get-gələ salmaq** – işini qəsdən uzatmaq, yubatmaq, süründürməyə salmaq, işinin

dalınca daim gedib-gəlməyə məcbur etmək. *Yusifi bir həftə idi get-gələ salmışdılar.*

**GETHAGET**[1] *zərf* Uzun yol gedərək, böyük məsafə qət edərək, gedə-gedə. *Gethaget kəndə çatdıq.*

**GETHAGET**[2] *is.* Böyük ziyan, zərər, çıxar. *Elə gəlhagəlin belə də gethagedi olar.* (Ata. sözü).

**GÉTMAN** [*pol.* əsli *alm.*] 1. Qədimdə Polşa qoşunlarının baş komandanı.

2. Qədimdə Ukraynada: kazak qoşunun başçısı və yüksək hakim.

**GETMANLIQ** *is.* Getman hakimiyyəti və idarəsi.

**GETMƏ** "Getmək"dən *f.is. Ümidin getməsini Bahar da istəyirdi.* B.Bayramov.

**GETMƏK** *f.* 1. Addım ataraq hərəkət etmək; yerimək, addımlamaq. *Asta-asta getmək. İti getmək. Piyada getmək. Yolla getmək. Yanınca getmək.* // Bir yerdən başqa yerə varmaq. *Şah Səlməxatuna işarə etdi ki, hərəmxanaya getsin..* M.F.Axundzadə. [Kərbəlayı Qubad:] *Gedirəm Sijimqulu bəyin yanına.* Ü.Hacıbəyov. // Nəqliyyat vasitəsində hərəkət etmək. *Qatarla getmək. Araba ilə getmək. Kəndə atla getmək.* // Bir yerə gedərkən birisinə yoldaşlıq etmək. *Qardaşı da onunla şəhərə getdi.* // Başqa yerə varmaq üçün olduğu yerdən ayrılmaq, yola düşmək, istiqamət almaq. *Xaricə getmək. Bağa getmək. Dənizə getmək. – Əziz Kamalı anasına tapşırıb cəbhəyə getdi.* S.Rəhman. // Eyni mənada nəqliyyat vasitələri haqqında. *Qatar gecə gedir. Təyyarə saat 6-da gedir.* // Olduğu yeri tərk etmək, oradan çıxıb getmək. *Evdən getmək. Şəhərdən getmək. Dərsdən getmək. İclasdan yarımçıq getmək.* – [Oğlan] *getmək istəyir, zəng çalınır, Sona gəlir.* H.Nəzərli.

2. Başqa bir yerə köçmək, yaşayış yerini dəyişmək. *Yaylağa getmək. – İrəvanda Cəfərabad məhəlləsində oturan kazak qoşunları iyunun ikisində Kəpəgir dağında yaylağa gedəsi idilər.* C.Məmmədquluzadə.

3. Keçmək, ötmək, keçib getmək. *Xiyabanla getmək.*

4. *dan.* Özünə sənət, peşə seçmək, bir işin dalınca varmaq. *Həkimliyə getmək. Müəllimliyə getmək. – Heç bilmirəm, niyə xalq bu tərtəmiz qələm işinə getdi, sən bu gilkərpic işinə.* S.Rəhimov.

5. Yolda, hərəkətdə olmaq (göndərilən şey haqqında). *Təyyarə Bakıdan Daşkəndə neçə saata gedir?*

6. Cərəyan etmək, vaqe olmaq, davam etmək. *Sinifdə dərs gedir. Məşğələ yaxşı gedir. – ..Çarpışma konsullar yerləşən məhəllələrdən çox uzaqda gedirdi.* M.S.Ordubadi. *Bu qayda ilə ata ilə oğul arasında söhbətlər gedir.* S.Rəhimov. *Çöldə qızğın biçin gedirdi.* S.Rəhman.

7. Yaxınlaşmaq, az qalmaq. *Günəş batmağa doğru gedirdi.* M.İbrahimov.

8. Bitmək, qurtarmaq, ötmək, keçmək, sona çatmaq. *Ömür getdi. Cavanlıq getdi. – Qış getdi, bahar oldu; Çöllər, təpələr doldu; Şən üzlü mələklərlə.* A.Şaiq [Xurşud:] *Gün gedib, aylar dolandı, padşahım gəlmədi.* Ü.Hacıbəyov. *Qış da yavaş-yavaş qarı və soyuğu ilə ötüb getdi.* Çəmənzəminli. // Yox olmaq, əldən çıxmaq. *İt də getdi, ip də.* (Məsəl).

9. Lazım olmaq, çatmaq, sərf olunmaq. *Xalata 5 metr parça gedir. – Bir quyunun qazılmasına gedən vaxtın yarıdan çoxunu başqa işlər aparır.* M.İbrahimov. // Ehtiyacı ödəmək, bəs olmaq, görmək. *Bu palto üç il gedər.* // Xərclənmək, sərf edilmək, işlənmək. *Bu qədər pul hara getdi?*

10. Tamaşaya qoyulmaq, göstərilmək. *Operada nə gedir?* "*Azərbaycan*" *kinoteatrında* "*Koroğlu*" *filmi gedir. – Bu axşam dram teatrında* "*Sevil*" *tamaşası gedirdi.* S.Rəhimov.

11. Aparıb çıxarmaq (yol haqqında). *Bu yol Göy gölə gedir.*

12. *məc.* Ölmək, dünyanı tərk etmək. *Mən gedərəmsə məramım genə dünyadə durar.* M.Ə.Sabir. *Ey könül, bu acı hisslərdən əl çək? İnsan bir gün gəlmiş, bir gün gedəcək.* M.Müşfiq.

13. Evlənmək, ərə getmək. [Şahsənəm:] *Ana, razı olun, gedim Qəribə; Ana, mən yazığı nə dindirirsən?* "Aşıq Qərib". [Nazlı:] *Dadaş, and olsun Allaha, mən Mirbağır ağaya getməyəcəyəm.* C.Məmmədquluzadə. [Sənəm:] *Heç bunun kimi gözəl qız qoca kişiyə gedərmi?* Ü.Hacıbəyov.

14. Bir ünvana göndərilmək, çatdırılmaq. *Məktub Moskvaya gedəcək.* – [Nərgiz Səməndərə:] *Həmin bu kitab instituta gedəcək, .. mühafizə olunacaqdır.* B.Bayramov.

15. *məc.* Rəvac olmaq, satılmaq. *Mal yaxşı gedir.*

16. Axmaq, cərəyan etmək (maye haqqında). *Evin dalından su gedirdi.*

17. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs.: fikrə getmək, xəyala getmək, rəngi getmək, əldən getmək.

◊ **Getsin gəlməsin** – təkrar olunması arzu edilməyən hadisə və ya bir iş haqqında söylənir. *Ağır günlər getsin gəlməsin.* – [Kəblə Məhəmməd:] *Ay usta, o illər getsin gəlməsin! Yadıma salma. Mənim də başıma az iş gəlmədi.* Çəmənzəminli. **Az getdi, üz getdi, dərə, təpə düz getdi...** – Azərbaycan nağıllarında "çox getmək" mənasında işlədilir.

**get-gedə** b a x **getdikcə**. [Zeynal] *get-gedə məişət pozğunluğunun çirkabı içinə yuvarlanırdı.* S.Hüseyn. *Muxtar get-gedə narahat olur, hətta darıxmağa başlayırdı.* B.Bayramov.

**GETMƏLİ** b a x **gedəcək**. *Əziziyəm, qalasız; Şəhər olmaz qalasız; Mən ki getməli oldum; Siz sağlıqnan qalasız.* (Bayatı).

**GÉTTO** [*ital.*] Orta əsrlərdə Avropada, habelə bəzi ölkələrdə: müəyyən dini və irqi qrupa mənsub adamların məcburən yaşamaları üçün ayrılmış şəhər rayonu məhəlləsi. *Zənci gettosu.*

**GEYDİRİLMƏ** "Geydirilmək"dən *f.is.*

**GEYDİRİLMƏK** 1. "Geydirmək"dən *məch.*

2. *tex.* Keçirilmək, yerinə salınmaq, taxılmaq. *Təkər oxa geydirildi.*

**GEYDİRMƏ** "Geydirmək"dən *f.is.*

**GEYDİRMƏK** *f.* 1. Geymək işini gördürmək, geyməyə məcbur etmək. *..Hüseynqulu ağa zinətli qaraçı libası tikdirib Qaraca qıza geydirirdi və öz qonaqlıqlarında oynadırdı.* S.S.Axundov.

2. Keçirmək, taxmaq, yerləşdirmək, qablamaq. *Oxu yerinə geydirmək.*

◊ **Don geydirmək** – b a x **don**[1].

**GEYƏCƏK** b a x **geyim**. [Çopo:] *Qəbilə şurası* [əlillərin] *yeyəcək, geyəcək və bütün ehtiyaclarını təmin etmişdi.* Çəmənzəminli.

**GEYİB-KECİNMƏ** "Geyib-kecinmək"dən *f.is.*

**GEYİB-KECİNMƏK** b a x **geyinib-kecinmək**.

**GEYİK** *is. zool.* Dağlıq meşələrdə yaşayan, bəzi cinsləri iri dallı-budaqlı buynuzlu, böyük və gözəl heyvan. *Dağlarda geyik mənəm; Buynuzu böyük mənəm; Yarın nə dərdi, qəmi; Ona ağır yük mənəm.* (Bayatı).

**GEYİLMƏ** "Geyilmək"dən *f.is.*

**GEYİLMƏK** 1. "Geymək"dən *məch. Paltar geyildi.*

2. *tex.* Keçirilmək, yerinə salınmaq, taxılmaq.

**GEYİM** *is.* Əyinə geyilən hər şey; paltar, üst-baş, libas. *Qış geyimi. Sadə geyim. Hərbi geyim.* – [Aslan bəy:] *Üç ay var ki, görməmişəm, geyimini bilmirəm...* C.Cabbarlı. [Usta Ağabalanın] *yay və qış libası bir-birindən seçilməyib həmişə üç-dörd geyimdən əmələ gəlirdi.* Çəmənzəminli. // *məc.* Örtü, pərdə mənasında.

**GEYİM-KECİM** *is.* Üst-baş, paltar. // Geyinmək tərzi. *Geyim-keciminə fikir vermək.* – *Aran yerindən gəlmiş adamlar öz səliqə-sahmanı, geyim-kecimi ilə dərhal fərqlənirdilər.* B.Bayramov.

**GEYİM-KECİMLİ** b a x **geyimli-kecimli**.

**GEYİMLİ** *sif.* 1. Əynində geyimi, paltarı olan, paltarlı. [Zeynalın] *qarşısına on bir-on iki yaşlı, sadə və təmiz geyimli, qara bir qız çıxdı.* S.Hüseyn. *Tirmə şal geyimli, qara saçlılar; Hər tərəfə zər nişanlar dolanır.* Aşıq Ələsgər. *Ağ geyimli, nurani bir dərviş yol kənarında görünür.* H.Cavid. // Geyinmiş, əynində geyimi olan, paltarlı (*çılpaq* əksi). *Geyimli halda bayıra çıxdı. Geyimli uşaq.*

2 *məc.* Üzəri bir şeylə örtülmüş, örtülü. *Yaşıl geyimli təpələr.* – *Al-əlvan geyimli dağlar gözəli, Sən kimdən öyrəndin vüqarı, lalə?* N.Rəfibəyli.

**GEYİMLİ-KECİMLİ** *sif.* Yaxşı, gözəl, səliqəli geyinmiş. Geyinib-kecinmiş; *geyimli-kecimli qız.* – *Salonun ortasında geniş açılmış yemək masasının ətrafında oturmuş geyimli-kecimli xanımlar əl çaldılar.* M.İbrahimov. *Ələddin əlində gül dəstəsi olan belə geyimli-kecimli qadından şübhələnmir.* H.Seyidbəyli.

**GEYİNDİRİB-KECİNDİRMƏ** "Geyindirib-kecindirmək"dən. *is.*

**GEYİNDİRİB-KECİNDİRMƏK** *f.* Birini yaxşı-yaxşı geyindirmək, bəzəndirmək. *Gəlini geyindirib-kecindirdilər. Uşağı geyindirib-kecindirmək. – ..Onu geyindirib-kecindirib məclisə gətirmişdilər.* Ə.Məmmədxanlı.

**GEYİNDİRMƏ** "Geyindirmək"dən *f.is.*

**GEYİNDİRMƏK** *f.* 1. Birinin əyninə paltar geydirmək yaxud paltarı geyməyə kömək etmək. *Pişxidmətlər .. şüru etdilər.. Yusif Sərracın köhnə paltarını soyundurmağa və xələti-şahanəni ona geyindirməyə.* M.F.Axundzadə. [Gəlini] *yaxşıca geyindirirlər, bəzəyirlər, sonra faytona mindirib allah-allah ilə aparırlar.* Ü.Hacıbəyov.

2. *məc.* Örtmək, sarmaq, çulğalamaq. *Ağ örtüyə büründürür aləmi; Çulğalayır, geyindirir aləmi.* A.Səhhət.

◊ **Don geyindirmək** – b a x **don**.

**GEYİNƏCƏK** *is. dan.* Paltar, geyim.

**GEYİNİB-KECİNMƏ** "Geyinib-kecinmək"dən *f.is.*

**GEYİNİB-KECİNMƏK** *f.* Yaxşı-yaxşı geyinmək, bəzək şeyləri taxmaq, bəzənmək. *Qız geyinib-kecinib Məlik Düçara dedi..* (Nağıl). *Geyinirik-kecinirik yurdumuzun varından; Ellər açır süfrəsini öz bağının barından.* S.Vurğun. [Şahnigar xanım] *geyinib-kecindi, hətta Kürə suya gedəndə də özünü daş-qaşla bəzədi*. İ.Şıxlı.

**GEYİNİB-KECİNMİŞ** *f.sif.* Yaxşı-yaxşı, səliqə ilə geyinmiş, geyinib-bəzənmiş.

**GEYİNMƏ** "Geyinmək"dən *f.is. Səhnədəkilər geyinmələrini tamam edirlər.* Ü.Hacıbəyov.

**GEYİNMƏK** *qayıd.* 1. Öz-özünü geyindirmək, əyninə, yaxud ayağına bir şey geymək. *Mirzə durub libasını geyinib getdi usta Zeynalın dükanına.* Ə.Haqverdiyev. *Camal həmin saat qalxıb geyindi.* M.Rzaquluzadə. *Dan yerinə səda düşəndə Firəngiz geyinib hazırlaşmışdı.* B.Bayramov.

2. Bu və ya başqa dəbdə, keyfiyyətdə, növdə paltar geymək. *Qısa geyinmək. İpək paltarlar geyinmək. – Getdik və yol gedərkən dostumu nəzərdən keçirdim, .. başdanayağa şıq geyinmişdi.* Çəmənzəminli. *Biz qalstuk taxırıq; Biz dəblə geyinirik.* B.Vahabzadə.

3. *məc.* Örtülmək, üzərinə pərdə çəkilmək. *Çöllər yaşıl geyinmişdi. – Geyinmiş dan yeri yenə qırmızı; Doğmuş səhərlərin müjdə yıldızı.* S.Vurğun. *Dərə-təpə al geyindi*; *Açdı əlvan gülün dağlar.* Aşıq Şəmşir.

**GEYİNMİŞ** *f.sif.* Paltar geymiş; paltarlı. *Geyinmiş uşaq. Geyinmiş halda.*

**GEYİŞ** *is. köhn.* Geymə işi, geymə (geyinmə) tərzi. *Əynində var sincab donun; Geyişin yarıma bənzər.* Aşıq Əmir.

**GEYİŞDİRMƏ** "Geyişdirmək"dən.

**GEYİŞDİRMƏK** b a x **gicişdirmək**.

**GEYİŞİK** b a x **gicişmə**.

**GEYİŞMƏ** "Geyişmək"dən *f.is.*

**GEYİŞMƏK** 1. B a x **gicişmək**.

2. *dan.* Bir-birinə keçmək, sarmaşmaq. *Saçları bir-birinə geyişib.*

**GEYMƏ** 1. "Geymək"dən *f.is.*

2. Üst paltarın altından geyilən qısa arxalıq. *Usta Zeynal yarımmahuddan tikilmiş köhnə geyməsini çıxarıb bükdü və qoydu bir səmtə..* C.Məmmədquluzadə. *Balta çaldıqca onun geyməsinin cındır qolu və ətəkləri yellənirdi.* Ə.Əbülhəsən. *İkisi də təzə geymə geymiş, başlarına qara mahud papaq qoymuşdular.* P.Makulu.

**GEYMƏK[1]** *f.* 1. Əyninə paltar, ayağa ayaqqabı və başa papaq keçirmək. *Çəkmələrini geymək. Pencəyini geymək. İsti paltar geymək. – Qurban .. durdu ayağa və ətəklərinin kəcini silib başmaqlarını geydi və yavaş-yavaş üz qoydu getməyə.* C.Məmmədquluzadə. [Ağa:] *Özüm də .. kürkü tərsinə geyib bir damın içində gizlənmişdim..* Ə.Haqverdiyev. *Oğlan atasının əlindən öpüb çıxdı və ox-yayını götürüb, dava libasını geyib bağa getdi.* Çəmənzəminli.

2. *məc.* Örtülmək, üstü örtülmək. *Dağlar ağ geymişdi.*

**GEYMƏK[2]** *is.* Geyim, paltar. *Yemək və geymək sarıdan uşaqlar korluq çəkmirdilər.* Ə.Əbülhəsən.

**GEYMƏLİ** *sif.* Geyməyə yararlı, geyməyə yarayan. *Geyməli paltar.*

**GEYSU** *is.* [*fars.*] *klas.* Saç, hörük. *Göz doymaz vəsməli kaman əbrudan*: *Can üzülməz səmən iyli geysudan.* M.P.Vaqif. *Atəşin ruyində əfitək yatıb geysulərin; Türfə cadudur ki, mar atəşdə suzan olmasın!* M.Ə.Sabir.

*Açıq-sarı geysuları dağılmışdır pərişan.* A.Səhhət.

**GƏBƏ** *is.* Böyük xalça, xalı. *Otağa gəbə döşəmək. – Biz oturduq yerə təzə döşənmiş təzə gəbələrin üstündə.* C.Məmmədquluzadə. *Evlərdən burovuz olaraq yığılan xalça və gəbələrlə xırman başdan-başa döşənmiş idi.* S.Hüseyn.

**GƏBƏÇİ** *is. köhn.* Gəbə, xalı toxuyan və ya gəbə alveri edən adam.

**GƏBƏÇİLİK** *is.* Gəbəçinin işi, peşəsi.

**GƏBƏRDİLMƏ** "Gəbərdilmək"dən *f.is.*

**GƏBƏRDİLMƏK** *məch.* Öldürülmək.

**GƏBƏRMƏ** "Gəbərmək"dən *f.is.*

**GƏBƏRMƏK** *f.* Ölmək (adətən heyvanlar haqqında). *Nədənsə bir neçə ay bundan əvvəl at qançır olub gəbərmiş.* C.Cabbarlı. *Tələyə də bir zorba siçovul çoxdan düşüb gəbərmişdir.* H.Sarabski. // Eyni mənada adam haqqında təhqir kimi işlənir. *Qonşunun oğlu gəbərdi.* – [Birinci işçi:] *Yetişir! Sızlama, abdal, başıboş; Ağlamaqdansa gəbərmək daha xoş.* H.Cavid.

**GƏBƏRTMƏ** "Gəbərtmək"dən *f.is.*

**GƏBƏRTMƏK** *f.* Öldürmək. *Yüzbaşını, oğlunu gəbərdib qaçdım dağa; Süründüm dağda-daşda, ələ vermədim yaxa.* S.Rüstəm.

**GƏC** *is.* [*fars.*] Gillə gipsin qarışığından hazırlanan al-sarımtıl rəngli maddə (suvaq işlərində istifadə olunur). *..Bir neçə gün bundan irəli çox şiddətli yağışdan zal otağının səqfinin bir parça gəci uçub tökülmüşdü.* C.Məmmədquluzadə. *Gəc ilə suvanmış bəzəkli evin sanki dirəkləri də süfrəyə tamahsılanırdı.* Mir Cəlal.

**GƏCXANA** *is.* [*fars.*] *köhn.* Gəc hazırlanan yer. // Gəc satılan dükan.

**GƏDA** *is.* [*fars.*] 1. *köhn.* Keçmişdə yoxsul, aşağı təbəqədən olan adamlara verilən ad. *Kükrər dağlar, bir-birinən deyini; Seçmək olmaz gədasını, bəyini..* Aşıq Ələsgər. [Rizvan:] *İnsan dimağı birdir, istər padşah olsun, istər gəda.* Ə.Haqverdiyev. [Qoca:] *Bizim üçün şah və gəda təfavütü yoxdur.* A.Divanbəyoğlu.

2. *məc. nifr.* Səviyyəsiz, ləyaqətsiz adam haqqında. *Gədaya borclu olma, ya toyda istər, ya bayramda.* (Ata. sözü). *Mən Həcərəm, əbrü ətləs geymənəm; Hər yetən gədayə boyun əymənəm.* Aşıq Ələsgər. *Ah, nə çıxılmaz yol imiş bu sevda; Tən etdi hər görən, güldü hər gəda.* H.Cavid. // *məc.* Dilənçi, fəqir, yazıq, binəva. *Camalın sədqəsi, hüsnün zəkatı; Mənim tək binəva gədayə düşər.* M.V.Vidadi. [Təhmas bəy:] *Əlimə çörəkçin baxan bir gəda; Salıb varlığımı bir yanar oda.* S.Rüstəm.

3. Bax **gədə** 1-ci mənada. *Rəhmə gəlib, padşahım, deməzsən; Harda qalıb bu dərgahın gədası.* Q.Zakir. [Ağaməhəmməd xan:] *..Ən ədna gədanın mənə yazığı gəlir, hamısının ədavətini qəlbimdən çıxararam.* Ə.Haqverdiyev.

**GƏDALIQ** *is.* 1. Əsil-nəsəbi olmama, aşağı təbəqədən olma. *Əl versə gədayə padişahlıq; Sanman ki, qılır dəxi gədalıq.* Füzuli. // Nökərlik. *Dərgəhində müttəsil fəxrim gədalıqdır mənim.* S.Ə.Şirvani.

2. *məc.* Alçaqlıq, nanəciblik. *Vəfalı qulunam, sana nökərəm; Padşahım, gəl gədalıq eyləmə.* Aşıq Mədəd. [Şəmsi bəy:] *Quldurbaşı Əlimərdanın oğlu Çingiz də öz gədalığını göstərdi.* S.S.Axundov. *Verilən ənamı geri almaq gədalıqdır.* C.Cabbarlı.

**GƏDƏ** *is. dan.* 1. Nökər. [Asya:] *Gülçöhrə bir gədəyə aşiq olubdur.* Ü.Hacıbəyov. [Əbdürrəhim:] *Xanım, doğrudur, mən özüm İskəndər bəyin gədəsini gördüm.* N.Vəzirov. [Sara bibi:] [Zeynəbin] *atası yumurta Heydər kim idi? Murad bəyin qapısının gədəsi deyilmiydi?* Qantəmir.

2. *dan.* Oğlan. [Ana:] *Ay Allah, bu gədə lap dəli olacaq.* S.Rəhman. [Turac:] *Qızlar, amma gədə yamanca pərt oldu.* İ.Əfəndiyev. // *dan.* Oğlana müraciət məqamında işlənir. [Hacı Qara:] *Gədə, nə danışırsan? Kimin həddi var mənim malımı ala!* M.F.Axundzadə. [Hacı Həsən:] *A gədə, ata arpa verin, yəhər-əsbabı sazlayın.* C.Məmmədquluzadə.

**GƏDƏBAŞI** *is. köhn.* Keçmişdə xan, bəy, dövlətli evinin nökərlərinə başçılıq edən adam; baş nökər.

**GƏDƏCİYƏZ** "Gədə"dən (2-ci mənada) *oxş.* Oğlancığaz, uşaqcığaz. [Gülpəri:] *Mənim gədəciyəzim evdə bekar oturub.* Ə.Haqverdiyev.

**GƏDƏ-GÜDƏ** *top. nifr.* Keçmişdə aşağı təbəqələrə mənsub adamlara verilən təhqirli ad. [Xırdaxanım:] *..Başın qarışıb gədə-güdəyə,*

*uşaq-muşağa, gecələr qumar, gündüz qumar.* N.Vəzirov. [Sara xanım:] *Murad bəyin o qədər mülkünü, bağını əlimizdən alıb öz gədə-güdələrinizə vermisiniz.* Qantəmir. // *top.* Nökərlər. [Məhərrəm bəy:] *Ay Hacı, işlər olub çox, özüm də tək, əgər gədə-güdə ümidinə qoyursan, hərəsi bir tərəfə çəkib evini dağıdır.* S.S.Axundov. // *məc. zar.* Adi adamlar, cəmiyyətdə aşağı mövqe tutan adamlar. *Olmaya damağına xanımlıq şirnisi dəyəndən sonra nazlanmısan, daha gədə-güdəyə məhəl qoymaq istəməyirsən?* B.Talıblı.

**GƏDƏK** *məh.* bax **balağ**[2].

**GƏDƏLİK** *is.* 1. Nökərçilik, nökərlik. *Sən bu qədər də kövrəkləşmə, Ələmdar, – deyə Müqim bəy dəsmalını çıxarıb gədəliyə götürdüyü Leyləyin gözlərini sildi.* S.Rəhimov.

2. *məc.* Alçaqlıq, nanəciblik.

3. *məc.* Görməmişlik.

**GƏDİK** *is.* Dağın beli; aşırım. *Dəlilər ancaq Çənlibelin gədiyində onun tozunu gördülər.* "Koroğlu". [Toğrul:] *Savalan dağlarının gədiklərində Ərtoğrul basılmış, bizimkilər çəkilirlər.* C.Cabbarlı. *Dəvə boynu kimi əyri dağ gədiklərini Murad dəfələrlə Əzizə tərifləmişdir.* Ə.Vəliyev.

**GƏH** *klas.* bax **gah**. *Gəh zülfün öpər, gəh düşər ayağına; Sənsən mənə həm qibləvü, həm Məkkə, Mədinə.* M.P.Vaqif.

**GƏH-GƏH** *klas.* bax **gah-gah**. *Gəh-gəh içib sərxoş olaq şərabı; Gündə sürək vəhdət ikimiz belə.* M.P.Vaqif. *Qaldı, mən getdimsə, ey namehriban, kuyində dil; Bari gəh-gəh sor dili biixtiyarımdan məni.* S.Ə.Şirvani.

**GƏHGİR** *sif.* Tərs, inadkar, inadcıl.

**GƏHİ** *klas.* bax **gahı**. *Gəhi babi, gəhi mürtəd, gəhi kafir adlandım; Döyüldüm, şaşqalandım, güllələndim, bəlkə odlandım.* Ə.Nəzmi.

**GƏLDİ-GEDƏR** *sif.* Müvəqqəti, daimi olmayan, qeyri-sabit. [Molla Xəlil:] *Bunların hamısı gəldi-gedər adamlardır.* S.Hüseyn. *Əldən-ələ keçir vəfasız həyat; Biz gəldi-gedərik, sən yaşa, dünya!* S.Vurğun. *..Bu göyərçinlər başqa köçəri quşlar kimi gəldi-gedər deyil.* M.Rzaquluzadə. // İs. mənasında. *Gəldi-gedərin biridir.*

**GƏLDİ-GEDƏRGİ** bax **gəldi-gedər**.

**GƏLDİKCƏ** bax **getdikcə**. *..Pristavın yanında on yeddi il mirzəlik elədim və gəldikcə şöhrət qazandım.* C.Məmmədquluzadə. □ **Yeri gəldikcə** – münasib vaxt olduqda, yeri düşdükcə, imkan olan kimi. *Yeri gəldikcə qeyd etmək. – Yeri gəldikcə Dəmirov hər kəsə mütəxəssislərin faydalı işlərindən bəhs edir.* S.Rəhimov.

**GƏLƏCƏK** 1. *sif.* Zaman baxımından hələ çatmamış, lakin çatması gözlənilən, indi yox, sonra olacaq; gözlənilən. *Gələcək görüş. Gələcək nəsil. – Baxdıqca bağçamda açan hər gülə; Qarşımda canlanır gələcək həyat.* A.Şaiq. *Düşüncəli gözlərində bir təbəssüm duyuram mən; Bəllidir ki, bir müjdədir o, gələcək əsrlərdən.* M.Dilbazi.

2. *is.* Hələ çatmamış, lakin çatması gözlənilən zaman (*keçmiş* əksi). *Gələcəkdən danışmaq. – Qayalar az qalır göylərə dəyə; Boylanıram yaxın bir gələcəyə.* S.Vurğun. [Səriyyə xala və uşaqları] *ağır bir köç kimi yorğun-yorğun yeriyir, dumanlı və anlaşılmaz bir gələcəyə doğru irəliləyirdilər.* M.İbrahimov.

3. *is.* Bir şeyin indiki deyil, sonrakı vəziyyəti, halı, taleyi. *Uşağın gələcəyi. Onun gələcəyi parlaqdır.* – [Məhəmməd ağa:] *İnsan ki oxumağa və elmə düşmən ola, onun gələcəyi nə olmalı idi.* N.Nərimanov. [Mirzə:] *Ancaq uşaqlarımın gələcəyinin fikrini də mənim özümə vagüzar ediniz.* Ə.Haqverdiyev. *Həyat nəşəsilə titrəyir içim; Parlaq gələcəyim, nəhayətim var.* M.Müşfiq.

4. **Gələcəkdə** şəklində *zərf* – bir iş və ya hadisənin sonradan, gələcək zamanda baş verəcəyini göstərir. *Gələcəkdə yeni əsər üzərində işləmək istəyir.* – [Qara kişi] *Fərmanı gələcəkdə özü kimi əli mişarlı, rəndəli və çəkicli bir kişi görmək istəyirdi.* Ə.Sadıq.

◊ **Gələcək zaman** *qram.* – felin, iş və hərəkətin danışılan zamandan sonra baş verib-verməyəcəyini bildirən zamanı. *Qəti gələcək zaman. Gələcək zaman şəkilçiləri.*

**GƏLƏLİ** *zərf* Gələndən sonra, gələndən bəri, gəlmişkən. [Nəbi:] *Bir gün görmədin mənə gələli; Nə gərdənlik taxdın, nə üzük taxdın.* S.Rüstəm. *Gülsabah gələli Muradla Göyçəyin yaşayışında o qədər yaxşı hadi-*

*sələr baş verib ki, hər ikisi şükür eləməkdən başqa ayrı söz demirlər.* Ə.Vəliyev.

**GƏLƏN** 1. *sif.* Bundan sonrakı, gələcək, gözlənilən, növbədəki. [Tahir:] *Ana, Lətifə, məktəbi gələn il qurtarır.* M.Hüseyn. *Fikirləşdi ki, indi də cavabını verməsə, gələn dəfə daha da böyük qələt eləyəcək.* H.Seyidbəyli. // Bir işi davam etdirən, nəsli əvəz edən; nəsil (əsasən cəmdə işlədilir). *..Hansı nicat yolunu açdıq ki, bizdən sonra gələnlər də bizim günümüzə düşməsin?* C.Məmmədquluzadə.

2. *is.* Qonaq, mehman. *Neçə nəfər gələnin var? – Zakir, başdan baxtın qaradır sənin; Göz dikmə yollara, kimdir gələnin?* Q.Zakir. *..Gələnlər birbaş mənim nömrələrimə düşürlər.* Ə.Haqverdiyev.

**GƏLƏN-GEDƏN** *is.* 1. Hər hansı bir münasibətlə bir yerə gəlib-gedən, qonaq-qara. *Bu evin gələn-gedəni çoxdur.*

2. Yoldan ötən, hər kəs. *Gələn-gedən tamaşaya dururdu.*

**GƏLƏSƏR** *sif. məh.* Gəlirli, gəliri, verimi, barı çox olan. *Gələsər yer. Gələsər torpaq.* – [Seyidli kəndinin] *üzüm bağları Gürcüstan bağları kimi gələsər deyildir.* S.S.Axundov.

**GƏL-GET** b a x **get-gəl**. *Gəl-get kəsilib.*

**GƏL-GƏL** *is.* Bir yerə çağırış, dəvət, çağırma. *Adama gəl-gəl deyən çox olar.* ◻ **Gəl-gəl etmək (eləmək)** – əlini tərpədərək çağırmaq, dəvət etmək. *Uşaq atasına gəl-gəl edir. – Pəncərədən əl eylər; Əlləri gəl-gəl eylər; O gözlər ki səndə var; Axırda əngəl eylər.* (Bayatı).

**GƏLHAGƏL[1]** *is.* Ardı-arası kəsilməyən bol gəlir. *Elə gəlhagəlin belə də gethagedi olar.* (Ata. sözü). *Bir il, dava düşən ili tacirlərin gəlhagəli idi.* Mir Cəlal. *Dedikcə yorulmadı öz ata-anasından; Vaxtilə gördükləri dövlətdən, gəlhagəldən.* S.Rüstəm. // Məc. mənada. – [Niyaz:] *Kefinin gəlhagəlidir, a bəxtəvər.* Ə.Haqverdiyev.

**GƏLHAGƏL[2]** *zərf* Uzun yol gələrək, böyük məsafə qət edərək; gələ-gələ. *Gəlhagəl kəndə çatdılar. – Gəlhagəl gəlib yetişdilər arvadın həyatinə.* "Koroğlu". *Gəlhagəl, gəlhagəl; Gəlib çatdılar dağa.* "Aşıq Ələsgər".

**GƏLİB-GEDƏN** b a x **gələn-gedən**. *Şərur qəzasında da, Dəhnə deyilən yerdə Maku xanları .. gəlib-gedənə aman vermirdilər.* E.Sultanov. [Xan:] *Biri gedib Ballıca yolunu kəsib, gəlib-gedənə sataşır, biri də qaçaqlıq eşqinə düşüb, üstümüzə ayaq alıb...* Çəmənzəminli.

**GƏLİM** *is.* Artım, məhsul artımı, qazanc, gəlir. *Gəlimi yoxdur.* – [Manqanın qızları] *pambığın builki gəlimindən, keçən il rayonda ən çox pambıq götürən adamlardan danışırdılar.* İ.Əfəndiyev.

**GƏLİMLİ** *sif.* Artımlı, çox məhsul verən, gəlirli, bol. *Bəziləri bu səslərdə ilin bolluğunu, gəlimli məhsul mahnısını oxuyardı.* Mir Cəlal.

**GƏLİN** *is.* 1. Toyu keçirilən, ərə gedən qız. *Gəlini məclisə gətirmək.* – [Məşədi İbad:] *Amma bu gəlin kişi çıxdı.* Ü.Hacıbəyov. *Gəlin aparmağa gələn dəstələr qapıda yığışıb intizar çəkər.* M.S.Ordubadi.

◻ **Gəlin köçmək** – ərə getmək. *..Gülpəri atasından iznsiz kəbin kəsdirib Əmiraslana gəlin köçdü.* S.S.Axundov. **Gəlin otağı** *etnoqr.* – 1) Toy günü gəlinlə bəy üçün ayrılıb bəzədilmiş otaq. *Şahsənəm gəlin otağına keçdi.* "Aşıq Qərib". *Ananın bəzədiyi təzə gəlin otağı; Olar azğın düşmənin kef məclisi, yatağı.* Ə.Cəmil; 2) *məc.* bəzəkli, qəşəng otaq mənasında. *Bura lap gəlin otağıdır. Gəlin otağı kimi bəzənmiş. – Xanım, Səriyyəgili yuxarı qaldırdı, .. fərşlərlə bəzənmiş və gəlin otağını andıran isti bir otağa gətirdi..* M.İbrahimov. // Təzəcə toyu olmuş, təzəcə ərə getmiş cavan qadın. *Heydər bəy alaçığın içində oturubdur bir gün irəli toy edib gətirdiyi gəlini ilə.* M.F.Axundzadə. *Səhər-səhər yaz çağı; Köçür oba yaylağa; Gəlinlərin balağı; Batır lilə, batlağa.* A.Səhhət. *Kərbəlayı Dünyamalı səslədi, səsinə o biri damdan bir cavan gəlin çıxdı.* E.Sultanov.

2. Qayınanaya, qayınataya görə oğlun arvadı. [Nənəxanım:] *Allaha heç rəva deyil ki, mənim taylarım hamama gedəndə boğçasını gəlini götürsün, .. amma mənim gəlinim olmasın!* Çəmənzəminli. *Sədəf öz gəlinini qucaqlayaraq məhzun baxışları ilə onu süzdü..* S.Vəliyev.

3. *məc.* Çox bəzəkli, gözəl, qəşəng, xoşagələn şey haqqında. *Yenə gəlin camalını açacaqdır, bizim dağlar; Bu ellərin sinəsindən*

*gedəcəkdir odlu dağlar.* S.Vurğun. *Azərbaycanın Göygöl kimi gözəl və misilsiz bir gəlini var.* M.İbrahimov.

4. Bax **gəlincik**[1] *..Səntək qızlar hələ gəlin oynadar.* C.Məmmədquluzadə. [Qız] *bir azdan sonra yorulub bir laləzarlıqda oturdu və lalələrdən gəlin qayırmağa başladı.* S.S.Axundov. *Balaca bir qız uşağı çıxdı. Əlindəki kifir gəlinlə oynadığı bilinirdi.* M.Hüseyn.

**GƏLİNATLANDI** *is. etnoqr.* Keçmişdə xalq adətincə gəlinin, ata evindən çıxıb ata minməsi mərasimi. // Bu mərasim vaxtı çalınan hava.

**GƏLİNBACI** *is. dan.* Cavan gəlinə qohumları tərəfindən verilən ad.

**GƏLİNBARDAĞI** *is.* Şərbət içilən qab, şərbətqabı.

**GƏLİNBARMAĞI** *is.* İri, uzunsov giləli üzüm növü.

**GƏLİNBOĞAN** *is.* Gecyetişən bərk armud növü.

**GƏLİNCİK**[1] *is.* Uşaq oyuncağı; kukla. *Dizinin üstündəki gəlincik qəribə gəlincik idi. Ağarəhim ömründə belə gəlincik görməmişdi.* İ.Məlikzadə.

**GƏLİNCİK**[2] *is. zool.* Məməlilər sinfinin yırtıcılar dəstəsindən balaca heyvan.

**GƏLİNCİK-GƏLİNCİK** bax **gəlin-gəlin**.

**GƏLİN-GƏLİN** *is.* Qız uşaqlarının gəlinciklə oynadıqları oyun (adətən "oynamaq" feli ilə). *Tubu qonşu evində qonşu qızları ilə gəlin-gəlin oynamaqla məşğuldur.* H.Sarabski. *Gəlin-gəlin oynayan Pərşan iyirmi bir yaşına çatıb orta məktəb qurtarmışdı.* M.İbrahimov.

**GƏLİNGÖRMƏSİ** *is. etnoqr.* Təzə gəlinin ailə üzvləri və yeni qohumlarla tanış olması mərasimi. *Gəlingörməsinə getmək. – Gəlin evində qız yengəsi və oğlan yengəsi başda oturmaq şərti ilə bütün şəhərin arvadları üçün gəlingörməsi məclisi açırdılar.* R.Əfəndiyev.

**GƏLİNQAYTARAN** *is. məh.* Uzunburun çarıq.

**GƏLİN-QIZ** *top.* Gənc qızlar və gəlinlər, qız-gəlin. *Kəndlilər uşaqlarına, gəlin-qızlarına tuman, köynək, yaylıq, şal və qeyri paltarlıq alacaqlar.* S.S.Axundov. [Xəlfə:] *..Gəlin aşaq dağ ardına, orda meydan düzəldək, qoy gəlin-qız burda çalıb-oynasın.* C.Cabbarlı.

**GƏLİNLİK** 1. *is.* Gəlin olma halı. *Gəlinlik illəri. – Qız gəlinlik yaşında; Nə çovğun görmüş, nə qar.* S.Vurğun.

2. *sif.* Gəlinə aid, gəlinə məxsus, gəlin üçün. *Gəlinlik bəzəyi. Gəlinlik duvağı. – Hələ gəlinlik xınası əlindən tamam getməyən Nazlı, arzuladığı oyuncağa yiyə durmuş uşaq kimi sevinirdi.* Ə.Əbülhəsən. [Çoban:] *Yoxsa qız özünə gəlinlik xalısı toxumaq istəyir?* Ə.Məmmədxanlı.

**GƏLİR** *is.* Əldə edilən qazanc, mədaxil. [Zeynalın] *ayda yüz manatdan artıq gəliri vardı.* S.Hüseyn. [Hacı Əhməd:] *Bəs o bağın gəliri kimə yetişəcək?* C.Cabbarlı.

**GƏLİRLİ** *sif.* Yaxşı gəliri, qazancı olan, qazanclı, mədaxilli, gəlir gətirən. *Gəlirli sənət. Gəlirli iş. Tərəvəzçilik gəlirli sahədir.* – [Yusif Hümmətə:] *Camaat üçün nə mənfəətlidir, nə gəlirlidir onu əksin.* B.Bayramov.

**GƏLİRLİLİK** *is.* Gəlirli olma; qazanclılıq, mədaxillik.

**GƏLİRSİZ** *sif.* Gəliri olmayan; qazancsız, mədaxilsiz. *Gəlirsiz iş. Gəlirsiz sahələr.*

**GƏLİRSİZLİK** *is.* Gəliri olmama; qazancsızlıq, mədaxilsizlik.

**GƏLİŞ** *is.* 1. Gəlmək işi, gəlmə. *Dost gəlişi bayram olar. – Heç o qədər də arzulamadığı və rəqibi olan qonağı – Aslan bəyin gəlişi Qasım bəyi açmadı.* A.Şaiq. [Türkan bəy Bəypolada:] *Gəlişiniz bizi nə qədər məmnun etdisə, əmin olunuz ki, gedişiniz də bir o qədər məhzun edir.* H.Cavid.

2. *ədəb. köhn.* Səhnə əsərlərində pərdənin bir hissəsi. *Birinci gəliş. Pərdə iki gəlişdən ibarətdir.*

◊ **Gəliş gəlmək** – qorxutmaq, təpinmək. [Narıngül:] *O, Gülzardı nədi, ona bir gəliş gələrəm ki..* İ.Əfəndiyev.

**GƏLİŞ-GEDİŞ** *is.* 1. Hərəkət, gedib-gəlmə, o tərəf-bu tərəfə hərəkət etmə. *Gəliş-gediş kəsildi. – Dəyirman işləməz, donar, gəliş-gediş çətinləşər; Bazarda nırxı şeylərin o dəm ziyadə yüksələr.* A.Səhhət.

2. Bir-birinin evinə gedib-gəlmə; əlaqə, münasibət. *Gəliş-gedişləri yoxdur.*

**GƏLİŞİGÖZƏL** *sif.* və *zərf* Elə-belə, xoş gəlmək üçün. *Gəlişigözəl söz. Gəlişigözəl danışmaq.*

**GƏLLAHI** *zərf dan.* Açıq, sərbəst, özbaşına. *Atı gəllahı buraxmaq. – Adam var, çölləri gəzər gəllahı; Adam var, tanımaz gözəl Allahı.* Aşıq Abbas.

**GƏLMƏ** 1. “Gəlmək”dən *f.is. Bu məktubun gəlməsini; Gözləmişdir uzun-uzun.* R.Rza.

2. *is.* Yerli olmayan, özgə yerdən, kənardan gələn; yad, özgə, qərib. [Xanburabi:] *Bu kimi batil fikirlər gəlmələrin uydurmasıdır.* Çəmənzəminli. *Yalnız arvadlar və gəlmələr çölə çıxırdı.* Mir Cəlal. // Sif. mənasında. *Gəlmə adam.*

**GƏLMƏK** *f.* 1. Hərəkət edərək, yeriyərək bir yerə varmaq, çatmaq, yetişmək. *Öz evimizə gəldik. Kinodan çıxıb mehmanxanaya gəldilər.* – [Hacı Bağır:] *Hə, axund, de görək nə xəbər ilə gəlmisən?* H.Nəzərli. // Üzü danışana tərəf hərəkət etmək, yerimək, yaxınlaşmaq. *Atlılar gəlir. Maşın gəlir.* – [Məşədi İbad:] *Aha, deyəsən, qız gəlir.* Ü.Hacıbəyov. // Nəqliyyat vasitəsilə bir yerə varmaq, çatmaq. // Qatar, gəmi, təyyarə haqqında. *Qatarla gəlmək. Təyyarədə gəlmək.* // Böyük bir məsafə qət edərək bir yerə çatmaq, yetişmək, varid olmaq. *Mən İrana gələn karvanla Xoy şəhərinə gəldim.* M.S.Ordubadi. // Yaxınlaşmaq, yanaşmaq. *Yanına gəlmək.* – ..*Kərbəlayı Heydər əmi qeyzlə çıxardı küçəyə və gəlib yapışardı qulaqlarımdan, qalxızardı göyə.* C.Məmmədquluzadə.

2. Kütləvi şəkildə, axınla hərəkət edərək bir yerdə dayanmaq, məskən salmaq, yerləşmək. *Yaylağa gəlmək.*

3. Eşidilmək, hiss olunmaq, çatmaq. *Arvad səsi gəlməyən yer biyabandır.* C.Məmmədquluzadə. *O yan-bu yandan güllə səsləri gəlirdi.* A.Şaiq. ..*Qan qoxusu gəlir, ölüm havası çalınırdı.* M.Hüseyn.

4. Çəkisi olmaq, ağırlığı olmaq. *Yemiş 2 kiloqram gəldi. Qarpız nə qədər gəldi?*

5. Görünmək, oxşamaq, təsəvvür edilmək. *Uzaqdan döyüş asan gələr. – A başına dönüm, sən mənim gözümə bir ağıllı adam gəlirsən.* Ə.Haqverdiyev. *Bu söhbətlər Fətullaya zarafat kimi gəlirdi.* Mir Cəlal.

6. Ərə getməyə razı olmaq, birini xoşlayıb ona ərə getmək; evlənmək. [Əsgər:] *İndi, görəsən, qız bilsə ki, mən doğrudan da arşın mal satanam, mənə gələrmi?* Ü.Hacıbəyov. *Bəyəndiyi qızlar da Məmmədbağıra gəlməyirdi.* S.Hüseyn.

7. Yaxınlaşmaq, yetişmək, çatmaq. *Qış gəlmişdi. Yaz gəlir. – Bahar füsunkar, əfsanəvi gözəlliyi ilə bizim ellərə gəlirdi.* M.Rzaquluzadə. // Yetişmək, gəlib çatmaq. *Elə bir vaxt gəlmişdir ki...*

8. Yağmaq. *Qar gəlir. Dolu gəlir. – Birdən İzzət qarı qızın qolundan tutub silkələdi: – Cəld tərpən, yağış gəlir..* Ə.Məmmədxanlı.

9. Təyin olunduğu yerə yetişmək, çatmaq (göndərilən şey haqqında). *Poçt gəldi. Bugünkü qəzetlər hələ gəlməyib.* – [İsmət:] *Çox şükür, Canpoladdan*; *Bu gün bir məktub gəldi.* H.Cavid. *Gündə Peterburqdan Gorusa möhürlü paket gəlir...* S.Rəhimov. // Xəbər, şayiə, məlumat və s. haqqında. *Xəbər gəldi. Yeni məlumat gəldi.*

10. Daxil olmaq, girmək, bir yerə yığışmaq. *İçəri gəlmək. Hamı zala gəldi.* – [Almaz Aftilə:] *Evinizə gəlmək olarmı?* C.Cabbarlı.

11. Cütləşməyə meyil etmək. *Qoça gəlmək* (qoyun haqqında). *Təkəyə gəlmək* (keçi haqqında). – *Musa kişi isə yenicə kələ gəlmiş sarı inəyin axurunu təmizləyib yerini rahatlamış*(*dı*).. M.İbrahimov.

12. Acımaq, turşumaq, yetişmək (xəmir haqqında). *Xəmir gəldi.*

13. *məc.* Zahir olmaq, görünmək; qaplamaq, çulğalamaq. *Üzünə sarılıq gəlmək. – Muxtar diksindi, sifətinə bir qırmızılıq gəldi.* Ə.Vəliyev.

14. Törəmək, nəşət etmək, çıxmaq. *Sözün kökü sanskrit dilindən gəlir. Onun bu xasiyyəti atasından gəlir.*

15. Bir şeyin vətənini, hasil olduğu və ya gətirildiyi yeri göstərir. *Bizə xına İrandan gəlir.*

16. Qoşulmaq, birləşmək. *Türk dillərində şəkilçilər sözlərin axırına gəlir.*

17. Meydana gəlmək, hasil olmaq. *İşləməkdən adama heç bir zərər gəlməz.*

18. Axmaq, cərəyan etmək (qaz və mayelər haqqında). *Arxdan su gəlir. Qaz yaxşı gəlir. Burnundan qan gəlir.*

19. Çıxmaq, görünmək. *Pəncərədən işıq gəlir.*

20. Görünmək, sanılmaq, təsəvvür edilmək. *Bu sözlər mənə yalan kimi gəlir.*

21. Yaramaq, münasib olmaq. *Uyğun gəlmək. Bu mənim işimə gəlməz.*

22. Yetişmək, bərabər olmaq, uyğun olmaq. *Paltar əynimə yaxşı gəlir. Onun başı mənim çiynimdən gəlir.*

23. Bir şeyin nəticəsi olmaq, bir şeydən yaxud bir şeyin nəticəsində törəmək, doğmaq, nəşət etmək. *Bunlar hamısı işi yaxşı bilməməkdən gəlir.*

24. Feli bağlama kimi tərkib daxilində işlənir; məs.: gəlib-yetişmək, gəlib çatmaq, gəlib çıxmaq, gəlib ötmək.

25. "Gəl", "gəlin" – bir işə dəvət mənasında xitab kimi işlənir. *Gəl sabahkı işlərimizdən danışaq.* – [Cahan:] *Sən gəl ata-baba yolu ilə evlən.* Ü.Hacıbəyov. [Orxan:] *Üzük, nişan yalnız könüldür, könül; Olma çocuq, sən gəl mənə ver könül.* H.Cavid. [Sitarə:] *Gəl toyumuz barəsində niyyət eləyək, gedək bayıra qulaq asaq, görək kim nə eşidər.* C.Cabbarlı.

26. Əmr formasında: **gəl** – məsləhət, xahiş bildirir. *Sən gəl, bu işə qarışma. Gəl daşı ətəyindən tök.*

27. "**Gələk**" şəklində – keçək, qayıdaq. *İndi köhnə məsələyə gələk.* – [Əzrək:] *Allaha and olsun ki, burda heç bir günah iş yoxdur... Qərəz, gələk mətləb üstünə!* Ə.Məmmədxanlı.

28. "**Gəldikdə**" şəklində – ...haqqında danışmaq lazımsa... *Onun məsələsinə gəldikdə... Romanın qəhrəmanına gəldikdə...* – [Hüsaməddin] *Səba xanımın iş düzəltməsinə gəldikdə, onun nə oyun oynamaq istədiyi mənim üçün aydındır.* M.S.Ordubadi.

29. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs.: gözə gəlmək, dilə gəlmək, cana gəlmək, həyəcana gəlmək, ağlına gəlmək.

**GƏLSƏNƏ** *əd.* Məsləhət, arzu, bir işə dəvət mənasında işlədilir. [Səlimə:] *Ay Qurban, gəlsənə bir az su gətirəm, ayaqlarını yuyam.* Ə.Haqverdiyev. *Qoşqar! ..Gəlsənə mən saqqalda adamı ələ salmayasan! – deyə, Sultan əlini çənəsinə çəkdi.* İ.Hüseynov.

**GƏM**[1] *is. k.t. köhn.* Vəl; sünbülü döymək üçün ata, öküzə qoşulan alət. *Mən qaçdım, mindim gəmə və çubuq ilə başladım malları sürməyə..* C.Məmmədquluzadə.

**GƏM**[2] *is.* Quzu, buzov və s. heyvan balalarının analarını əmməməsi üçün ağızlarına vurulan dəmir, çubuq və s.-dən toxunmuş tor.

**GƏMƏ** *is. məh.* 1. Dərzin yarısı, yarımdərz. *Gəmə bağlamaq.*

2. Kiçik ot tayası, tayacıq.

**GƏMİ** *is.* Su nəqliyyatı vasitəsi. *Yelkənli gəmi. Hərbi gəmi. Ticarət gəmisi. – Gəmisini itirən çarığını axtarmaz.* (Ata. sözü). *Elə bil gəmilər suda üzməyir; Əlvan çiçəklərin içində üzür.* O.Sarıvəlli. □ **Gəmi dəftəri** – gəminin keçdiyi yerlər, vaxt, baş verən hadisələr, qərarlar və s. qeyd olunan dəftər. **Gəmi-restoran** – restoran kimi istifadə olunan gəmi. **Hava gəmisi** – təyyarə və s. uçucu nəqliyyat vasitəsi. // Şairanə təşbehlərdə. *Bəxtinin gəmisi qəm dəryasında; Düşüb qasırğaya, tufana gedir.* M.Rahim.

◊ **Gəmiləri (gəmisi) dənizdə (dəryada) batmaq (qərq olmaq)** – iflasa uğramaq, var-yoxu əldən çıxmaq, müflis olmaq (çox qəmli, qüssəli, kədərli adam haqqında). *Elə qəmgindir, elə biləsən, gəmisi dənizdə batıb.*

**GƏMİ-BƏRƏ** *is.* Çoxlu miqdarda və ya ağır yük və s. daşımaq üçün çox güclü, iri gəmi, habelə iki sahil arasında nəqliyyat vasitələrini qovuşduran gəmi. "*Azərbaycan*" *gəmi-bərəsi Xəzərin iki sahili arasındakı gəmi yollarını calaşdırır.*

**GƏMİÇİ** *is.* 1. Gəmini idarə edən, yaxud gəmidə işləyən adam. *Qabaqda duran gəmiçi yelkəni irəli sürdü, taxtanı götürüb qoydu və Fəxrəddini yelkənin içərisinə aldı.* M.S.Ordubadi. *Gəmiçi özünü itirsə əgər; Tufanlar içində qərq olub gedər.* S.Vurğun. // Dənizçi.

2. *köhn.* Gəmi sahibi. *Gəmidə oturub gəmiçi ilə dalaşır.* (Ata. sözü).

**GƏMİÇİLİK** *is.* 1. Gəmiçinin işi, sənəti, peşəsi. *Ən uşaqlıqdan möhnətə adət etmiş Məşədi Əsgər gəmiçilik işinə mahir olduqda özü üçün bir barkaz alıb işlətməyə şüru etdi.* S.M.Qənizadə.

2. Gəmi nəqliyyatı. *Kürdə gəmiçilik işləri müntəzəm bir şəklə salınacaq, balıqçılıq in-*

*kişaf edəcəkdir.* Ə.Sadıq. *Arktikanın öyrənilməsi şimal dənizlərində gəmiçiliyin və hava nəqliyyatının inkişafına böyük yardım göstərdi.* (Qəzetlərdən). // Həmin nəqliyyat işləri ilə məşğul olan idarə, müəssisə. *Xəzər dəniz gəmiçiliyi.*

**GƏMİK** b a x **sümük**. *Şamil* [Aslan bəyi] *diqqətlə müayinə etdi, .. onda əskimiş, gəmiklərinə qədər işləmiş beş-altı xəstəlik tapdı.* A.Şaiq. [Qoca Baxşı:] *Baxşı da orada idi. O, Sonanın baş gəmiyinə baxır və düşünürdü.* C.Cabbarlı. *Şəhid sıyrılaraq gəmikdən, ətdən; Alacaq payını əbədiyyətdən.* M.Müşfiq.

**GƏMİQAYIRAN** *is.* Gəmiqayırma sənayesi işçisi. *Gəmiqayıranların müvəffəqiyyətləri.*

**GƏMİQAYIRMA** *is.* Gəmi qayırmaqla məşğul olan. *Gəmiqayırma sənayesi.*

**GƏMİQURDU** *is. zool.* Taxta gəmilərə və taxtadan tikilmiş qurğulara ziyan vuran qurd. *Gəmiqurdu adlanan yumşaqbədənlilər taxta gəmilərə və taxtadan tikilmiş alman qurğularına böyük ziyan vurur.* "Sualtı aləm".

**GƏMİ-PEYK** *is. xüs.* Planetlərin orbitinə buraxılan, tədqiqat aparmaq üçün lazımi cihazlarla təchiz olunmuş hava gəmisi. – *Gəmipeykdə qoyulmuş qurğular sisteminin normal işləməsi haqqında məlumat alındıqdan sonra gəmi-peykin orbitdən yerə enməsi üçün komanda verilmişdir.* (Qəzetlərdən).

**GƏMİRCƏK** *is.* 1. Qığırdaq.

2. Atın (və ya eşşəyin) burun deşiklərində əmələ gələn və kəsilib atılmaqla müalicə edilən şiş. *At gəmircək olmuşdur.* – *Kəlbalı at ustalığı edər, at gəmircəyini kəsər*(*di*).. S.Rəhimov. *Direktorla baytar işçiləri atın gəmircəyini kəsdirməklə məşğul ikən Qəhrəman mənzilinə gəldi.* Ə.Vəliyev.

**GƏMİRİCİLƏR** *cəm, zool.* Kəsici dişləri yaxşı inkişaf etmiş heyvanlar dəstəsi (siçan, siçovul və s).

**GƏMİRİK** *sif.* 1. Gəmirilmiş halda olan, dişlək-dişlək, dişlə didişdirilmiş. *Gəmirik alma.*

2. Yeyilmiş, sınıq-salxaq. *Tapdığın bütün dişləri gəmirik və mırıqdı.* Ə.Vəliyev.

**GƏMİRİKLƏMƏ** "Gəmirikləmək"dən *f.is.*

**GƏMİRİKLƏMƏK** b a x **gəmirmək**.

**GƏMİRİLMƏ** "Gəmirilmək"dən *f.is.*

**GƏMİRİLMƏK** *məch.* Dişləm-dişləm edilmək, dişlə didişdirilmək; çeynənmək.

**GƏMİRİLMİŞ** *f.sif.* Dişlə bərk sıxılıb didişdirilmiş, parçalanmış.

**GƏMİRİŞDİRMƏ** "Gəmirişdirmək"dən *f.is.*

**GƏMİRİŞDİRMƏK** *f.* Gəmirmək (çoxları bir yerdə).

**GƏMİRİŞMƏ** "Gəmirişmək"dən *f.is.*

**GƏMİRİŞMƏK** *f.* 1. Bir-birini gəmirmək, dişləmək. *Siçanlar gəmirişir.*

2. *məc.* Bir-birini qapmaq (bərk dalaşmaq, söyüşmək).

**GƏMİRMƏ** "Gəmirmək"dən *f.is.*

**GƏMİRMƏK** *f.* 1. Bərk bir şeyi dişlərilə dişləmək, bərk sıxıb parçalamaq, çeynəmək; didişdirmək. *İtin peşəsi sümük gəmirmək olar. Əlini gəmirmək.* – *Həsi çalışıb Hatəmxanın sağ əlinin baş barmağını iti dişləri arasına keçirtdi, bütün qüvvəti ilə elə gəmirdi ki, Hatəmxanın qolu keyiyib dondu..* S.Rəhimov. [İt] *əsla tələsmədən əti götürdü və bir-iki addım kənara çəkilib ədəblə gəmirdi..* M.Rzaquluzadə.

2. Çeynəmək, yemək, qırıb tökmək. *Siçan ipləri gəmirib.* – [Novruzəli:] *..Qoy ulağın qıçını bağlayım, yoxsa gedər ağacları gəmirər.* C.Məmmədquluzadə. // Məc. mənada. *Az qalır sahili gəmirsin dəniz; Tufan içindədir bu gün ölkəmiz.* S.Vurğun. *Dənizdə tufan qalxır, Xəzərin ağ köpüklü çılğın dalğaları sahili gəmirirdi.* M.Hüseyn.

3. Bir sıra isimlərlə yanaşı gələrək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: bığını gəmirmək, içini gəmirmək, ürəyini gəmirmək.

**GƏMİRTLƏMƏ** "Gəmirtləmək"dən *f.is.*

**GƏMİRTLƏMƏK** *f.* Dişləyib yemək, gəmirmək. [Tələbə:] *Bu armuddan qabıqlı-qabıqlı altı dənəsini gəmirtlədim.* Qantəmir.

**GƏMİRTLƏNMƏ** "Gəmirtlənmək"dən *f.is.*

**GƏMİRTLƏNMƏK** b a x **gəmirilmək**.

**GƏMİRTLƏNMİŞ** b a x **gəmirilmiş**. *Səkkiz-doqquz yaşında bir oğlan uşağı əlində bir gəmirtlənmiş alma bizim yanımıza gəlib elə bərkdən ağlamağa başladı ki, guya ətini kəsirlər.* C.Məmmədquluzadə.

**GƏMİŞDİRMƏ** "Gəmişdirmək"dən *f.is.*

**GƏMİŞDİRMƏK** *f.* Alıcı quşu ov üzərinə saldırmaq, ovu tutmaq üçün uçurmaq. *Tərlan gəmişdirib Çənlidə küsər; Gələr qıya çalar Koroğlu səni.* "Koroğlu". *Gəmişdirib xanlar tülək tərlanı; Diddirib tökərdi yazıq heyvanı.* H.K.Sanılı. *Tərlanları gəmişdirmək Gəraybəyə tükənməz bir zövq verirdi.* S.Rəhimov.

**GƏMİŞMƏ** "Gəmişmək"dən *f.is.*

**GƏMİŞMƏK** *f.* Ov dalınca şığımaq, uçmaq (alıcı quşlar haqqında). *Gəmişdi tərlanım şığıdı, getdi; Ünlədim, ünlədim, önümdən ötdü.* Aşıq Kərəm. *Qızılquş kəkliyə gəmişən kimi ulduzlu təyyarələr .. damğalı təyyarələrə gəmişirdi.* S.Rəhimov.

**GƏMLƏMƏ** "Gəmləmək"dən *f.is.*

**GƏMLƏMƏK** *f.* Buzovun, quzunun ağzına gəm vurmaq.

**GƏMLƏNMƏ** "Gəmlənmək"dən *f.is.*

**GƏMLƏNMƏK** *məc.* Ağzına gəm vurulmaq (quzu, buzov və s. haqqında).

**GƏNC**[1] 1. *sif.* Yeniyetmə, cavan, hələ yaşa dolmamış (*qoca* ziddi). – *Araz çalışqan, zəhməti sevən, öz qüvvət və məharətinə inanan ciddi və iradəli bir gənc idi.* A.Şaiq. *Bizim aramızda .. yeddi-səkkiz nəfər gənc tələbə, bir nəfər də kiçik komandir vardı.* S.Hüseyn. *İçəri gözəl, gənc bir qadın girdi.* S.Rəhman. // Gəncliyə xas olan, aid olan. *Gənc qüvvələr. Gənc həyat eşqi. // is.* Cavan, yeniyetmə oğlan. *Qocalar və gənclər. – Susanna kimi bir qızı hər bir gənc sevə bilər.* M.S.Ordubadi. *Dar küçədəki köhnə evin alçaq qapısına bir gənc yanaşıb zəngi çaldı.* Çəmənzəminli. *Mirzağa iyirmi beş yaşlarında bir gənc idi.* S.Hüseyn.

2. *sif.* Cavan (ağac və s. haqqında). *Gənc ağac. – Ey bu gənc dağların biqərar yolçusu; Qanatlan! Çalındı yüksəliş borusu.* M.Müşfiq.

3. *sif.* Meydana yeni gəlmiş, təcrübəsi az olan. *Frazeologiya dilçilik elminin gənc sahələrindən biridir. // məc.* Hər hansı bir sahədə fəaliyyətə yenicə başlamış. *Gənc yazıçı. Gənc mütəxəssislər.*

**GƏNC**[2] [*fars.*] *is.* Xəzinə, dəfinə. *Görüb, Vahid, xəyal etdim üzündə zülfi-pürçinin; Ki, guya gənc üstündə yatıbdır əjdaha zülfün.* Ə.Vahid.

**GƏNCƏFƏ** *is.* [*fars.*] *köhn.* bax **qumar**. *Zülm zəncirinin altında çəkir işgəncə; Eyibdir sən uyasan gəncəfəyə, şətrəncə.* A.Səhhət. [Gəray:] *Yox, inanma, eşitdin isə bunu; Oynadım mən də gəncəfə oyunu..* A.Şaiq. ☐ **Gəncəfə kağızı** – qumar kağızı.

**GƏNCLƏŞDİRİLMƏ** "Gəncləşdirilmək"dən *f.is.*

**GƏNCLƏŞDİRİLMƏK** *məch.* Cavanlaşdırılmaq.

**GƏNCLƏŞDİRMƏ** "Gəncləşdirmək"dən *f.is.*

**GƏNCLƏŞDİRMƏK** *icb.* 1. Daha cavan etmək, cavanlaşdırmaq. *Dağ havası adamı gəncləşdirir.* – [Nigar:] *Özünü gərək gəncləşdirəsən!* S.Hüseyn. // Bir təşkilatın və s.-nin tərkibinə gəncləri daxil etmək. *Təşkilatı gəncləşdirmək.*

2. *məc.* Daha gənc, cavan göstərmək. *Bu paltar onu gəncləşdirir.*

**GƏNCLƏŞMƏ** 1. "Gəncləşmək"dən *f.is.*

2. Daxili sekresiya vəzilərinin fəaliyyətinin güclənməsi vasitəsilə qocalmış orqanizmə gənclik əlamətlərinin qayıtması.

**GƏNCLƏŞMƏK** *f.* 1. Getdikcə gənc olmaq, cavanlaşmaq, yetkinləşmək. *Gəncləşmək* [Muradın] *əlində deyildi. Onu təbiət qocaltmışdı.* S.Hüseyn. *Könül istər şeir yaza; Gəncləşirəm yaza-yaza.* S.Vurğun. *Getdikcə Kərim daha yekəlib kişiləşir, Səlim isə boy atıb gəncləşirdi.* S.Rəhimov. // *məc.* Özünü gənc kimi hiss etmək, qıvraqlaşmaq. *Vannalardan sonra lap gəncləşmiş kimiyəm.*

2. *məc.* Tərəqqi etmək, inkişaf etmək, yeniləşmək. *Dönməz oğulların iradəsindən; Gəncləşir qocaman Vətən torpağı.* S.Vurğun. *Hər gün bir il gəncləşən boy atan bir ölkədə; Nə qədər nəğmə vardır hələ bəstələnməmiş.* R.Rza.

**GƏNCLİK** *is.* İnsan həyatının yeniyetməlikdən yetkinliyə qədər olan dövrü, gənc yaşlar, cavanlıq (*qocalıq* ziddi). *İnsanın çocuqluğu və gəncliyi keçmişin qoynunda basdırıldığı üçün o, daima keçmişi xatırlamalıdır.* M.S.Ordubadi. *Gənclik eylə bir nemət ki, onunla hər şey insana xoş görünür.* H.Cavid. *Gənclik – arzuların uçuş nöqtəsi..* B.Vahabzadə.

2. *top.* Yetişməkdə olan nəsil, gənc nəsil; cavanlar. *Dünyanın demokratik gəncliyi. – Qoynumuzda ana yurdun öz atalıq haqqı var; Qoy baş əysin gəncliyimiz ataları görəndə.* S.Vurğun.

3. Həyatın bu dövrünə xas olan, aid olan. *Gənclik vüqarı. Gənclik qüruru. Gənclik həvəsi. – Etdi məni gənclik şövqüm əhatə; Verdim sərsəm küləklərə könlümü.* M.Müşfiq. *Sanki* [Fərhadoğluna] *dağlardan güclü bir gənclik qüvvəti gəldi.* S.Rəhimov.

**GƏNDALAŞ** *is. bot.* Pisqoxulu, birillik yabanı bitki. *Gəndalaş kolu. Qara gəndalaş.* – [Umudun] *canında heysizlik vardı. Suya girmək istəyirdi, amma yerindən qalxmağa həvəsi yox idi. Təzədən başını gəndalaş kolunun altına soxdu.* İ.Məlikzadə. // Bu bitkinin xırda dənəli meyvəsi.

**GƏNDALAŞLIQ** *is.* Çoxlu gəndalaş bitmiş yer.

**GƏNƏ** *is. zool.* Xırda caynaqları ilə heyvanların, bəzən də insanların bədəninə yapışıb onların qanını soran buğumayaqlı parazit. *İti gənə basıb. İnsana xəstəlik keçirən gənələr xüsusi bir qrup təşkil edir.* ◻ **Hörümçək gənəsi** *zool.* – bitkiyə ziyan verən gənə növü. *Hörümçək gənəsinə qarşı mübarizə aparılması üsulu.*

**GƏNƏCİK** *is.* 1. Kiçik gənə, balaca gənə.

2. *zool.* Ziyanverici buğumayaqlı parazit. *Gənəcik adətən yarpağın alt tərəfində yerləşir.*

**GƏNƏGƏRÇƏK** *is.* 1. *bot.* Toxumundan həmin adda yağ alınan bitki. *Gənəgərçək bitkisi.*

2. Həmin bitkinin toxumlarından alınan yağ (işlətmə dərmanı kimi işlənilir). [Dərviş] *qabı zeytun yağı əvəzinə gənəgərçəklə doldurur, gətirir Molla Nəsrəddinə verir.* "M.N.lətif." ◻ **Gənəgərçək yağı** – bax **gənəgərçək** 2-ci mənada. *Zahirən Mahmudun dükanı səkkizbucaqlı bir qutuya bənzəyirdi ki, içində saqqız, tumanbağı, gənəgərçək yağı .. tapmaq mümkün idi.* B.Talıblı.

**GƏNƏLİ** *sif.* Gənəsi olan, gənə daraşmış, gənə basmış. *Gənəli it. Gənəli inək. Gənəli pişik.*

**GƏNƏŞİK** *is. dan.* Məsləhət müşavirəsi.

**GƏNƏŞİKLİ** *sif. dan.* Məsləhətlə, razılıqla düzələn, əldə edilən; məsləhətli. *Gənəşikli iş. – Gənəşikli baş salamat olar.* (Ata. sözü).

**GƏNƏŞMƏ** "Gənəşmək"dən *f.is.*

**GƏNƏŞMƏK** *f. dan.* Birisinin rəyini bilmək üçün onunla məsləhətləşmək, məsləhət üçün birinə müraciət etmək. *Vuran oğul dayısına gənəşməz.* (Ata. sözü). [Həsən:] *Yaxşı, sən get, mən də dalınca gələrəm, deyirəm, qızın anasına da bir gənəşim.* Ə.Haqverdiyev. *Qızı bir neçə yerdən istəyən var, ancaq dayılarına da gənəşmək lazımdır.* A.Şaiq.

**GƏNGİZ** *is. bot.* Şoran torpaqlarda bitən kol bitkisi.

**GƏNZİK** *is. anat.* Damağın arxa hissəsi, boğaz boşluğunun ağızla birləşən hissəsi. *Çörək gənziyinə sıçradı. Gənzik iltihab olduqda qulaq pərdəsi yırtıla da bilər.*

**GƏR¹** [*fars.*] *klas.* bax **əgər**. *Gər girişsəm çalhaçala; Quş gərəkdir qanad sala.* "Koroğlu". *Sən gər mənim olsan fəna dünyada; Elə billəm padşaha dönmüşəm.* M.P.Vaqif. *Məsəldir: bir paydan bir adam doyar; Gər bölünə, ikisin də ac qoyar.* Q.Zakir.

**GƏR²** *is. məh.* Əsasən qoyun, keçi və başqa heyvanlarda olan qoturluq xəstəliyi. *Keçi gər olub.*

**GƏRAYLAMAQ** *f. folk.* Gəraylı oxumaq, gəraylı çağırmaq. *Aşıq gəraylayır.*

**GƏRAYLI** *is.* Aşıq şerində: hər bəndi dörd misradan ibarət səkkiz hecalı şeir forması (birinci bəndin misraları bəzən bir üç, bəzən iki dörd şəklində, qalan bəndlərin üç misrası bir-biri ilə, dördüncü misralar isə birinci bəndinə həmqafiyə olur). *Ağı dedi buz bağlayan lal sular; Bayatılar qara geydi əyninə; Gəraylılar qəm götürdü çiyninə.* B.Vahabzadə. ◻ **Gəraylı demək (çağırmaq)** – bax **gəraylamaq**. [Əbdürrəhim bəy:] *Əlinin ikisini də qoy qulaqlarının dibinə, gəraylı çağır.* N.Vəzirov. *Aşıq gəraylı deyib səsini ucaldanda hər tərəfdən "ay can, ay can!" nidaları eşidilirdi.* B.Bayramov.

**GƏRÇƏK** [*fars.*] bax **gənəgərçək**. *Gərçək tumu.*

**GƏRÇİ** *əd.* [*fars.*] *klas.* Hərçənd, baxmayaraq, əgərçi. *Hər xilqətə gərçi bir səbəb var; Aya səbəbi kim etdi izhar?* Füzuli. *Nə qədər olsa qoca gərçi Vidadi xəstə; Genə Vaqif*

*kimi, əlbəttə, yüz oğlana dəyər.* M.V.Vidadi. *Gərçi hər dildə var qəzetlər çox; Bizə ondan və leyk faidə yox.* S.Ə.Şirvani.

**GƏRD**[1] *is.* Toxunma parçada, xalı-gəbədə qırışıq yer.

**GƏRD**[2] [*fars.*] *is. məc.* Dərd, hüzn, ələm. *Dövranın gərdi məndə; Can qurban dərdi-məndə; Eşqə ürcah olanın; Tapılar dərdi məndə.* (Bayatı).

**GƏRDƏ** *is.* Sünbül döyümündən qalan saman qırıntıları.

**GƏRDƏK** *is. etnoqr.* Toyda oğlan evində gəlin üçün pərdə ilə ayrılmış xüsusi yer. [Telli:] ..[Gəlini] *otağa aparıb gərdək dalında oturdurlar, ürəyin tıp-tıp döyünə-döyünə gözləyirsən.* Ü.Hacıbəyov. [Fitnə:] *..Şux gəlinlər, sevgi doğan gərdəklər; Gözəl qızlar, qara tellər bizimdir.* A.Şaiq. // Pərdə, örtük mənasında.

**GƏRDƏKLİ** *sif.* Gərdəyi olan; pərdəli. *Gərdəkli qapı.*

**GƏRDƏN** *is.* [*fars.*] *köhn.* Boyun. *Boyun sürahidir, bədənin büllur; Gərdənin çəkilmiş minadan, Pəri.* M.P.Vaqif. *Ağ incə geyimli gözəl küncdə dayanmışdı. Qara saçları ağ gərdənini qaplamışdı.* Çəmənzəminli.

**GƏRDƏNBƏND** *is.* [*fars.*] 1. Boyunbağı (qadın bəzəyi). *Gərdənbənd taxmaq. – ..Övrətlər baş örtülərini dal tərəfdən bağlardılar və qabaq tərəfdən boyunları açıq qalardı; boğazı və gərdənbəndləri görsənərdi.* C.Məmmədquluzadə. [Hacı Kamyab] *..mücrüdən bir ədəd mirvari gərdənbənd çıxardıb qızının boynuna keçirdi.* Ə.Haqverdiyev. [Çimnazın] *boynundan salxım-salxım qızıl gərdənbəndlər, zəncirlər və sap-sap mirvari boyunbağılar asılmışdı.* Ə.Məmmədxanlı.

2. B a x **gərdənlik** 1-ci mənada. *Atın gərdənbəndi.*

**GƏRDƏNBƏNDLİ** *sif.* Gərdənbəndi olan, gərdənbənd taxmış; boyunbağılı. *Gərdənbəndli gəlin.*

**GƏRDƏNƏ** *is.* Uca dağlar arasında olan alçaq gədik; keçid. *Köç dağın gərdənəsindən aşdı. – Maşın dolama yolları fırlandıqca geniş dağarası bir gərdənə görünürdü.* S.Rəhimov.

**GƏRDƏNLİ** *sif.* Qəşəng, gözəl gərdəni olan. *Gərdənli qız. – Əli ucaboy, gərdənli, qarasaqqal, xoşsima bir kişi idi.* N.Nərimanov. *Ortaboylu Səkinə ətə-cana dolmuş, gözəlləşmiş, gərdənli bir qadın olmuşdu.* M.İbrahimov. // Enlidöş.

**GƏRDƏNLİK** *is.* 1. Arabaya, vələ və s.-yə qoşulan heyvanların boynuna keçirilən bir üzü dəri, bir üzü isə keçədən tikilən qoşqu ləvazimatı; xamut. *Gərdənliyi atın boynuna keçirmək.*

2. B a x **gərdənbənd** 1-ci mənada. [Nəbi:] *Bir ağ gün görmədin mənə gələli; Nə gərdənlik taxdın, nə üzük taxdın.* S.Rüstəm.

**GƏRDƏNSİZ** *sif.* Qısa və yöndəmsiz boynu olan.

**GƏRDİ** *is. məh.* Lək. *Soğan gərdisi.*

**GƏRDİŞ** *is.* [*fars.*] 1. Gəzinti, seyr. ☐ **Gərdiş etmək (eləmək)** – gəzmək, hərəkət etmək, dolanmaq, o baş-bu başa gedib-gəlmək. *Ərəb pəhləvan meydana çıxdı, bir o başa gərdiş elədi, bir bu başa gərdiş elədi, gəlib əmudun dəstəyindən yapışdı.* “Koroğlu”. *..Cavan sürətlə otaqda gərdiş eləməyə başladı və gərdiş etdikcə çənəsində bitən .. tükləri əli ilə vurub şişmərlədi.* Çəmənzəminli. **Gərdişə gətirmək** *məc.* – qızışdırmaq, coşdurmaq, hərəkətə gətirmək. *Aslan paşa əmr elədi, mehtərbaşı qabaqca Dəmirçioğlunun atını minib gərdişə gətirdi.* “Koroğlu”. // Gəzmə, yerimə tərzi; yeriş. *Qəmzəsi can alan, gərdişi əla; Doğrudan gözəldir, göyçəkdir Leyla.* Ə.Cavad.

2. *məc.* Dövran, dövr etmə, dolanma, hərlənmə. *..Dünyanın gərdişinə görə insan gərək öz rəftarın da dəyişsin.* “Əkinçi”. *Qalın meşə, yaşıl ot .. insana ləzzət verir. Gərdişin comərdliyini anlayırsan.* N.Nərimanov. *Nə etmək, fələkin gərdişi rəqqasə qadınlar kimidir...* Ə.Məmmədxanlı.

**GƏRDUN** *is.* [*fars.*] *klas.* 1. Göy qübbəsi.

2. *məc.* Tale, bəxt, fələk, iqbal. *Nə yar edərdi cəfa, nə rəqib, nə gərdun; Zəmanədə bu cəfalar mənə qəzadəndir.* S.Ə.Şirvani.

**GƏRƏK** 1. *əd.* Gərəkdir, lazımdır (cümlədə xəbər mənasında işlənir). *Söz gərək ox keçməz qayadan keçə; Yoxdursa sözünün kəsəri, – yazma..* M.Araz. ☐ **Gərək olmaq** – lazım olmaq, işə yaramaq, kara gəlmək. *Dost dosta nə gündə gərək olar?* (Ata. sözü). *Tənbəldən kömək olmaz; Kimsəyə gərək*

*olmaz; İşində çalışgilən; Zəhmətsiz yemək olmaz.* (Bayatı).

2. Feildən qabaq işlənərək, onun ifadə etdiyi işin, hərəkətin olmamasının və ya olmasının arzu edildiyini bildirən modal söz. *Gərək gedim. Gərək o sözü deməyəydim. – Onu bilirsənmi ki, mən sabah gərək Tovuzda olam?* S.Hüseyn. [Nəbi:] *Düşünüb bayaqdan tökmüşəm tədbir; Gərək sinə gərək düşmənə əlbir.* S.Rüstəm. [Qara kişi:] *Gərək hamıya yaxşılıq eləyəsən ki, öləndə hamı rəhmət desin.* B.Bayramov.

3. *bağl. mənasında.* İstər, həm. *Gərək dost, gərək düşmən.*

4. *İs. mənasında, dan.* Yaraq, silah, ləvazimat. *Gərəyini götürdü. – Yüz gün yaraq, bir gün gərək.* (Ata. sözü).

**Gərəkdir** şəklində – lazımdır, vacibdir, zəruridir. *Dərd çəkənə gərəkdir.* (Ata. sözü). *Xumar-xumar baxan ala gözlərin; Gərəkdir verəsən can qabağında.* M.P.Vaqif. *Ey dust, bizə huriyü-qılman nə gərəkdir; Yüz huriyü-qılman ola, könlüm səni istər.* S.Ə.Şirvani.

◊ **Gərək ki** – ehtimal ki, deyəsən, olsun ki, yəqin ki. [Yusif:] *On ildir ki, Şamdan ilə görüşməmişəm. İndi, gərək ki, surəti də təğyir tapıbdır.* N.Nərimanov. [Əminə:] *Başımda şal otağa girdim, gərək ki, suqabını götürmək istəyirdim.* M.S.Ordubadi.

**GƏRƏKLİ** *sif.* Lazımlı, lazım, gərək, gərək olan, əhəmiyyətli, zəruri. *Mən ömrümün aşrımında anlaya bildim; Nəçiliyim kimliyimdən gərəkli imiş...* M.Araz.

**GƏRƏKLİK** *is.* Lazımlılıq, yararlılıq, əhəmiyyətlilik, zərurilik, gərək olma. *Elə ki itirdin gərəkliyini; Dünyada hər şeyi itirəcəksən.* B.Vahabzadə.

**GƏRƏKMƏ** "Gərəkmək"dən *f.is.*

**GƏRƏKMƏK** *f. dan.* Lazım olmaq, gərək(li) olmaq. [Qoca:] *Demədinmi bəlkə gərəkərsən?* M.Rzaquluzadə.

**GƏRƏKMƏZ** *zərf* 1. İstəməz, lazım deyil, gərək deyil (*cümlədə xəbər məqamında işlənir*). *Mənə sənsiz cahanü-can gərəkməz; Vüsalın var ikən hicran gərəkməz.* Nəsimi. *Yarəb, mənə cismü-can gərəkməz; Cananımsız cahan gərəkməz.* Füzuli. □ **Gərəkməz ki...** – istəməz ki...; lazımdır, gərəkdir. [Almaz:] *Yəni gərəkməz ki, bir mənası da olsun?* C.Cabbarlı.

2. *Sif. mənasında.* Lazım olmayan. *Gərəkməz şey gərəkli gündə.* (Ata. sözü).

**GƏRƏKMƏZLİK** *is.* Lazımsızlıq, gərək olmama.

**GƏRƏKSİZ** *sif.* Gərək olmayan, lazımsız, yaramayan, yararsız, əhəmiyyətsiz. *Gərəksiz şey. – Bunlar bütün boş-boş gərəksiz işdir.* A.Səhhət. *Yüz xal düşür ürəyimin varaqlarına; Eh, nə bilim, bir gərəksiz misraya görə.* M.Araz.

**GƏRƏKSİZLİK** *is.* Lazımsızlıq, gərək olmama, lazım olmama, yaramama.

**GƏRGƏNC**: **gərgənc etmək** – yaş gönü, dərini qurutmaq üçün yerə salıb gərərək kənarlarını mıxlamaq. *Gönü gərgənc etmək.*

**GƏRGİN** *sif.* 1. Gərilmiş halda olan; tarım, dartılmış, tarım çəkilmiş. *Gərgin iş. Gərgin sim. // məc.* Gərginlik halında olan. *Gərgin əzələlər. Əsəbləri gərgin halda olmaq. – Qollar güclü, qollar gərgin, ağır daşlar; Qaldırılır üfüqlərə.* M.Müşfiq.

2. Böyük və arasıkəsilməz iş, zəhmət və enerji tələb edən; intensiv. *Gərgin zəhmət. – Bol məhsul götürmək üçün gərgin iş, səmərəli əmək tələb olunur.* Ə.Vəliyev. *Mədədov taqımla gedəndən sonra, .. səbirsizliklə cəbhənin gərgin vuruşmalar gedən sahələrinə göndəriləcəyini gözlədi.* Ə.Əbülhəsən. *Gərgin işlə açırsan; Son zamanlar səhəri.* M.Seyidzadə. // Zərf mənasında. *Bayaqdan bəri qaşlarını çatıb gərgin diqqətlə qulaq asan Qaraş heyrətlə bir atasına, bir də anasına baxdı.* M.İbrahimov. [Çiyələyin] *əlləri böyük çeviklik, səliqə göstərsə də, ürəyi, fikri də aydın, gərgin işləyirdi.* B.Bayramov.

3. Çətin, ağır; həllini (çıxış yolunu) tələb edən. *Gərgin vəziyyət. Gərgin beynəlxalq münasibət.*

4. *məc.* Ağır, sıxıntılı, ciddi, çətin, gərginliklə keçən. *Gərgin daxili həyəcan. – Həmin bu gərgin dəqiqələrdə Ciminin çöhrəsi sədrin hər hərəkətini təəccüblü bir həssaslıqla əks etdirirdi.* İ.Əfəndiyev. *Ölkə müharibə dövrü üçün çox təbii olan son dərəcə gərgin, həyəcanlı bir vəziyyət keçirirdi.* Ə.Əbülhəsən. □ **Gərgin olmaq** – ağırlaşmaq, vəziyyəti pisləşmək, pozulmaq. *Nəcəf bəyin haləti gərgin olub, tez-tez otaqda var-gəl edib sonra gəlir.* Ə.Haqverdiyev.

**GƏRGİNLƏŞDİRİLMƏ** "Gərginləşdirilmək"dən *f.is.*

**GƏRGİNLƏŞDİRİLMƏK** *məch.* 1. Gərgin hala salınmaq, tarımlaşdırılmaq, gərgin edilmək.

2. *məc.* Ağırlaşdırılmaq, ciddiləşdirilmək, çətinləşdirilmək. *Vəziyyət daha da gərginləşdirildi.*

**GƏRGİNLƏŞDİRMƏ** "Gərginləşdirmək"dən *f.is.*

**GƏRGİNLƏŞDİRMƏK** *f.* 1. Gərgin hala salmaq; tarımlaşdırmaq.

2. *məc.* Ağırlaşdırmaq, ciddiləşdirmək, gərgin etmək, çətinlətmək. *Vəziyyəti gərginləşdirmək.*

**GƏRGİNLƏŞMƏ** "Gərginləşmək"dən *f.is.*

**GƏRGİNLƏŞMƏK** *f.* 1. Dartılmaq, tarım çəkilmək, gərgin olmaq. *Əsəbləri gərginləşdi. – Soldatın üzü ani bir titrəyişlə tərpəndi, əzələləri daha da gərginləşdi..* M.İbrahimov. *Hamı dayandığı yerdə dondu. Bütün duyğular gərginləşdi.* Mir Cəlal.

2. *məc.* Çox ağırlaşmaq, çətinləşmək, pisləşmək. *Münasibətlər gərginləşdi. – ..Bu müraciətlərə baxmayaraq, vəziyyət yaxşılaşmadı, əksinə olaraq, daha da gərginləşdi.* M.S.Ordubadi. [Firidun] *getdikcə gərginləşən dünya hadisələrinin çox qəti bir çarpışmaya doğru hərəkət etdiyini duyurdu.* M.İbrahimov.

**GƏRGİNLİK** *is.* 1. Gərgin şeyin hal və vəziyyəti. *Zəncirin gərginliyi. – Şofer traktoru işə salıb təkərini yavaş-yavaş burmağa, kəndirin gərginliyini artırmağa başladı.* Mir Cəlal.

2. Son dərəcə qüvvə, diqqət, enerji tələb edən hal. *Əzələlərin gərginliyi. Gözlük gözləri gərginlikdən qoruyur. İşin gərginliyi.* – [Firidunun] *yorğunluqdan tutulmuş üzündə və gözlərində bir gərginlik vardı.* M.İbrahimov. [Cahandar ağanın] *ürəyi az qaldı köksünü partladıb çıxsın, daxili gərginlikdən qulaqları ağrıdı.* İ.Şıxlı.

3. *məc.* Ağırlıq, çətinlik; gərgin, çətin vəziyyət, gərgin hal. *Beynəlxalq gərginliyi zəiflətmək. – O, öz məruzəsində eyni zamanda olan vəziyyətin gərginliyindən istifadə edən və yaxud özünü itirən adamları göstərmək istəyirdi.* S.Rəhimov.

4. *fiz.* Qüvvə, temperatur və b. xarici təsir nəticəsində cisimdə baş verən təzyiq qüvvəsi və ya genəlmə kəmiyyəti.

5. *fiz. tex.* Elektrikin, cərəyanın gücünü göstərən fiziki halı. *Gərginliyi 220 volt olan elektrik cərəyanı. Yüksək gərginlik xətti.*

**GƏRGİNLİKLİ** *sif. fiz.* Gərginliyi (bax **gərginlik** 5-ci mənada) olan. *Yüksək gərginlikli elektrik cihazı.*

**GƏRİLMƏ** "Gərilmək"dən *f.is.*

**GƏRİLMƏK** *məch.* 1. Bərk dartılmaq, tarım çəkilmək, tarımlanmaq. *Sazın telləri gərildi. Gəminin yelkənləri gərildi. // məc.* Gərgin hala gəlmək, gərginləşmək. *Əsəbləri şiddətlə gərildi, damağını dumanlı bir atəş sardı.* A.Şaiq. *Elə ki qalxıram masa dalından; Xəyalım dikilir, fikrim gərilir.* B.Vahabzadə.

2. Qanadları dümdüz hala gəlmək, tam açılmaq. [Turac] *yerdən iki-üç addım hündürdə uçaraq gərilmiş qanadlarını bir dəfə belə çalmadan süzməyə başladı.* M.Hüseyn.

**GƏRMƏ**[1] "Gərmək"dən *f.is.*

**GƏRMƏ**[2] *is.* Təzək. *Məmmədəli əminin həyətinin aşağı tərəfində bir yekə gərmə qalağı var idi.* C.Məmmədquluzadə. *Yastığı gərmədir, döşəyi yovşan; Çamırlı kahada qış soyuq vaxtı.* H.K.Sanılı.

**GƏRMƏK**[1] *f.* Gərilmiş hala gətirmək, dartmaq, tarım etmək, açmaq. *Qarğa döşünü gərməsə qaz olmaz.* (Ata. sözü). *Qulac qollarımı gərrəm; Meydanda hünər göstərrəm.* "Koroğlu". *..Leylək hər iki qolunu yana gərib var gücü ilə bir də gərnəşdi..* S.Rəhimov. ☐ **Qanad gərmək** – qanadlarını bütünlüklə açmaq, uzatmaq. *Tərlan genişlik sevər; Göylərdir onun yeri; Qanad gərsin, dolaşsın; Sonsuz mavilikləri.* R.Rza. // Obrazlı təşbehlərdə. *Hər tərəfdə əsrarəngiz bir sükut qanad gərmişdi.* M.Hüseyn. *Ölüm müdhiş qanadını uşağın üstünə gərmişdi.* Mir Cəlal. // Bir şeyi uclarından və ya kənarlarından çəkərək düz hala gətirmək.

◊ **Sinə gərmək** – çətinlikdən çıxmaq, qalib gəlmək. *Təzə bəlalara biz sinə gərdik; İstiqbal milləti sevindirmədi.* B.Vahabzadə.

**GƏRMƏK**[2] *is.* [*fars.*] Yemişdən əvvəl yetişən qovun növü. *Qovunun, gərməyin qurudu tağı; Getməz bu sinəmdən qarpızın dağı.* Aşıq Məmməd.

**GƏRMƏKKİMİLƏR** *cəm bot.* Gərmək, süpürgə və bəzi başqa bitkilərin daxil olduğu fəsilə.

**GƏRMƏNC** *is. məh.* Atı tutmaq üçün gərilmiş ip. *Bu atı gərmənc olmasa tuta bilməyəcəyik.*

**GƏRMƏŞOV** *is. bot.* Bozumtul, yumşaq gövdəsi, dairəvi yarpaqları olan tikansız bitki. *Cavan oğlan nazik gərməşov saplı şallağını tərpədib kəlləri hayladı.* Ə.Vəliyev. *..Qocanın bir qoyun dərisindən ibarət olan yatağı yanında torpaq döşəməyə sancılmış bir gərməşov çubuğu yanırdı..* İ.Məlikzadə.

**GƏRNƏŞMƏ** "Gərnəşmək"dən *f.is.*

**GƏRNƏŞMƏK** *f.* Bir vəziyyətdə qalmaqdan yorulmuş, keyimiş əzələləri normal vəziyyətə gətirmək üçün qollarını qaldıraraq gövdəsini sağa-sola qarıb bədən əzələlərini hərəkətə gətirmək. *Xudayar bəy durdu ayağa, bir gərnəşdi, əsnədi..* C.Məmmədquluzadə. [Gülbadam] *heç bir şey söyləməyib bir az gərnəşdi.* N.Nərimanov. *Mübaşir Məmməd həyətə çıxdı. Sərin havada qollarını açıb gərnəşdi..* M.İbrahimov.

**GƏRNUŞ** [*fars.*]: **gərnuş etmək (eləmək)** *köhn.* – təzim etmək, baş əymək, baş endirmək. [Elçi] *..yeddi yerdə gərnuş eləyib, naməni Şah Abbasa təqdim elədi.* (Nağıl).

**GƏŞT** *is.* [*fars.*] Gəzmə, dolanma, seyr, səyahət. ☐ **Gəşt etmək (eləmək, qılmaq)** – gəzmək, seyr etmək, dolaşmaq. *Durdular iki qardaş, atları yəhərləyib dedilər: – Gedək bir qədər gəşt eyləyək, tainki bəlkə bir fikrimiz dağıla.* (Nağıl). *Əcəl gəşt eyləyib göydən enəndə; Heyif, cavanları salı kəməndə..* Aşıq Ələsgər. **Gəştə çıxmaq** – b a x **gəşt etmək**. *Bir üzü gül, rəngi lalə, zülfü tər; Gəştə çıxıb dərər tazə bənövşə.* M.P.Vaqif. *Yeddi gündür xanım çıxıbdır gəştə; Qapılar gəzməkdən macal da yoxdur.* Aşıq Hüseyn.

**GƏTİRİCİ** 1. *is. köhn.* Malını dükanda deyil, gəzdirərək satan, ayaq üstə alver edən adam; küçə alverçisi. *Bir gün gətiricidən bir baş pendirə ancaq bir manat 30 qəpik verdim.* C.Məmmədquluzadə.

2. *Sif. xüs.* Axıdıb gətirən, çatdıran, nəql edən. *Gətirici kanal.*

**GƏTİRİLMƏ** "Gətirilmək"dən *f.is.*

**GƏTİRİLMƏK** "Gətirmək"dən *məch.* *Axşam satılan oğurluq maldan pristavın payı gətirilib qumar oynadığı yerdə özünə verildi.* Ə.Haqverdiyev. *Neçə gün idi ki, bazara ət gətirilməmişdi.* S.Hüseyn. *Mollayev təzəcə gətirilmiş* (f.sif.) *çaya limon saldı.* M.Hüseyn.

**GƏTİRMƏ** 1. "Gətirmək"dən *f.is.*

2. *sif. mənasında.* Başqa yerdən gətirilən, alınan. *Gətirmə mal. Qaz çəkilməsi dövlət üçün hər il yüz milyonlarla manat vəsaitə, milyonlarla ton gətirmə kömürə qənaət etmək deməkdir.*

**GƏTİRMƏK** *f.* 1. Bir şeyi əlinə götürərək, yaxud dalına yükləyərək olduğu yerdən başqa yerə köçürtmək, çatdırmaq (*aparmaq* ziddi). *Nənəxanım suyu gətirib, aftafada küncə qoydu və palazları geri qatladı.* Çəmənzəminli. *Günorta üstü poçtalyon Bahadura təcili bir məktub gətirdi.* S.Rəhimov. // Eyni mənada nəqliyyat haqqında. *Trolleybus adamları gətirdi. Təyyarə çoxlu yük gətirdi.* // Çatdırmaq. *Məlumatı vaxtında gətirdilər.*

2. Birinin hərəkətini yönəltmək, özü ilə bərabər bir yerə gəlməsinə kömək, yaxud özü ilə bərabər gəlməyə məcbur etmək. *Uşağı evə gətirmək. Məktəbliləri gəzməyə gətirmək.* – [Şah:] *Bu saat fərraş göndər, münəccimbaşını mənim hüzuruma gətirsin.* M.F.Axundzadə. [Əsgər:] *Bəyim, yaxalanan məhbusu gətirdi.* H.Nəzərli.

3. Özü ilə bərabər götürüb gətirmək, qovub gətirmək. *Sel çoxlu kötük gətirdi. Yel özü ilə yağmur gətirdi. – Çay bəzən dağ boyda böyüyür, köklü ağacları qoparıb gətirir.* Ə.Vəliyev.

4. Bar vermək, meyvə vermək, məhsul vermək. *Ağac yaxşı alma gətirib. – Gətirdiyin yumurtadan nəticə, cücə gözləmə!* M.Ə.Sabir. // Məc. mənada. *..Çünki orda bar gətirir ən müqəddəs arzular; Çünki orda həqiqət var, səadət var, həyat var.* Ə.Cəmil.

5. *məc.* Hər hansı bir işdə müvəffəqiyyət qazanmaq, müvəffəqiyyət əldə etmək, uğurlu olmaq. *Əli gətirmək. Bəxti gətirmək. – Leyləyin işi bircə məsələdə gətirmirdi.* S.Rəhimov. *Budaq indi-indi gümrahlaşırdı ki, birdən yenə də onunku gətirmədi.* Ə.Vəliyev. *Deyəsən, bu gün Tamaşanınkı gətirmirdi.* Mir Cəlal.

6. Təlqin edərək, inandıraraq və yaxud dilə tutaraq birini öz əqidəsindən, fikrindən döndərməyə, bir şeylə razı salmağa nail olmaq (adətən isimlərə qoşularaq işlədilir). *Razılığa gətirmək. İnsafa gətirmək. İmana gətirmək.*

7. İfadə etmək, davam etdirmək, çatdırmaq, başa çıxmaq. *Sözün dalını gətirə bilmədi. – [Oğlan] tez-tez danışır, dili də şirindir, "r" səsini gətirə bilmir. "Yarım"a "yağım" deyir.* Mir Cəlal.

8. Bir şeyin nəticəsi olmaq, törətmək, səbəb olmaq, vermək. *Fərəh gətirmək. Sevinc gətirmək. İstilik gətirmək. – Dənizdən əsən xəfif meh .. xoş bir sərinlik gətirirdi.* M.Hüseyn. *Yabançı bir adam kimi büzüşüb oturan Qulu furqona bir soyuqluq gətirdi.* M.İbrahimov. *Bəndalı həmişə evə gələndə bir şənlik, xoşluq gətirərdi.* Mir Cəlal.

9. Bir sıra isimlərə qoşularaq, müxtəlif ifadələr və mürəkkəb sözlər əmələ gətirir, məs.: üzr gətirmək, pənah gətirmək, tab gətirmək, bəhanə gətirmək, şəkk gətirmək, dünyaya gətirmək.

**GƏTİRTDİRMƏ** "Gətirtdirmək"dən *f.is.*

**GƏTİRTDİRMƏK** b a x **gətirtmək**.

**GƏTİRTMƏ** "Gətirtmək"dən *f.is.*

**GƏTİRTMƏK** *icb.* Məcburiyyət altında gətirmək, zorla gətirmək, başqası vasitəsilə gətirmək. *Kitabları gətirtmək. – Əlbəttə, Veys həbsə almaq üçün gətirtdiyi adamlarla elə belə fənərin altında da durub danışa bilərdi.* Ə.Əbülhəsən. *Müəllim Mayisi göndərib maşını gətirtdi.* Ə.Vəliyev.

**GƏTİZDİRMƏ** "Gətizdirmək"dən *f.is.*

**GƏTİZDİRMƏK** b a x **gətirtmək**.

**GƏVƏLƏMƏ** "Gəvələmək"dən *f.is.*

**GƏVƏLƏMƏK** *f.* Könülsüz, iştahasız, ağzından tökülə-tökülə yemək; çeynəmək. *Kazımın oğlu yavan çörəyi gəvələyərək qaşqabağını salladı.* Çəmənzəminli. [Xalıqverdi] *..çarıqlarını soyunub corablarını qurutdu, axırda da çörəyi isidib gəvələməyə başladı.* Ə.Vəliyev. [Mərdan] *əlində iri bir alma tutaraq gəvələyir və gözlərini süzərək Nəcəfə baxırdı.* Q.İlkin.

**GƏVƏN** *is. bot.* Quraqlıq yerlərdə bitən, alçaqboylu, kitrəli, çox vaxt tikancıqlı yarpaqları zəif inkişaf etmiş ot və ya kol bitkisi. *Gəvəni ancaq dəvə yeyər. – Gəvən kolu nədir ki, kölgəsi də nə olsun.* (Ata. sözü). *Bu dərənin gəvəni; Oğlan, qaytar dəvəni; Get babana degilən; Versin bizə nəvəni.* (Bayatı).

**GƏVƏNNƏŞMƏ** "Gəvənnəşmək"dən *f.is.*

**GƏVƏNNƏŞMƏK** *f.* Sallanmaq, aşağı əyilmək (ağac və budaqları haqqında).

**GƏVƏŞ** *is. dan.* Raxit xəstəliyinin xalq arasında işlənən adı.

**GƏVƏZƏ** *is.* Çoxdanışan, lağlağı, boşboğaz, yanşaq, naqqal. *Sən demə bu yanşaq gəvəzənin biri imiş.* "Koroğlu". // Sif. mənasında. *Gəvəzə adam. – Nə pisdi, bu səsə qatıb səsini; Gəvəzə qarğalar tərif yazsalar.* M.Araz.

**GƏVƏZƏLƏMƏ** "Gəvəzələmək"dən *f.is.*

**GƏVƏZƏLƏMƏK** *f.* Çox danışmaq, naqqallıq etmək, yanşaqlıq etmək, boşboğazlıq etmək. *Bu gün çox gəvəzələdin.*

**GƏVƏZƏLİK** *is.* Naqqallıq, yanşaqlıq, lağlağılıq, boşboğazlıq, çox danışma xasiyyəti. *Zeynalın gəvəzəliyi bitməyirdi.* A.Şaiq. ☐ **Gəvəzəlik etmək** – çox danışmaq, boşboğazlıq etmək, naqqallıq etmək.

**GƏYAN** *sif. məh.* 1. Yarıqaranlıq, tam aydın, işıq olmayan. *Gəyan gecə.*

2. İkirəng, iki rəngdə olan. *Gəyan at.*

**GƏYİRİK** b a x **gəyirmə** 2-ci mənada.

◊ **Gəyiriyi azmaq** – mədənin pozulması nəticəsində həddən artıq gəyirmək.

**GƏYİRMƏ** 1. "Gəyirmək"dən *f.is.*

2. Mədədə əmələ gələn qazların, bəzən də mədədəki qidanın hissəcikləri ilə birlikdə ağızdan çıxması; gəyirti, gəyirik.

**GƏYİRMƏK** *f.* Mədədə əmələ gələn qazları, bəzən də qidanın hissəciklərini ağıza qaytarmaq. *Bir az yedikdən sonra Teymur ağzını mollanın lap burnunun qabağına tutub bərkdən gəyirir.* "M.N.lətif." *Səttar kişi şirin çayı içib stəkanı nəlbəkiyə qoyanda gəyirdi.* Ə.Əbülhəsən.

**GƏZ**[1] *is. klas.* Dəfə, kərə. *Min can olaydı kaş məni-dilşikəstədə*; *Ta hər birilə bir gəz olaydım fədasına.* Füzuli. *Müddətdi həsrətəm bir gəz bəri bax*; *O xan gözlərinin sədəqəsi canım.* Q.Zakir.

**GƏZ**[2] *is.* Püstə, badam və ya qozdan hazırlanan kövrək şirniyyat növü.

**GƏZ**[3] *is. məh.* Ağac, şalban və s.-nin başında yarıq, çapıq, haça yer.

**GƏZDƏK** *is.* Dağ təpəsində çökək yer.

**GƏZDİRİLMƏ** "Gəzdirilmək"dən *f.is.*

**GƏZDİRİLMƏK** "Gəzdirmək"dən *məch.*

**GƏZDİRMƏK** *f.* 1. Birisinin əlindən tutaraq, ya qucağına götürərək, yaxud miniyə mindirərək, yaxud da yanınca özü ilə bərabər hərəkət etdirmək. *Uşağı bağda gəzdirmək. Körpəni gəzdirmək. Uşaqları maşında, faytonda gəzdirmək.* – [Əhmədi] *lap körpəliyindən xalı-xalça üstündə gəzdiribmiş..* "Koroğlu". *Dildar uşaqları gəzdirməyə aparmışdı.* Ə.Vəliyev. // Cilovundan tutaraq hərəkət etdirmək. *Tərini soyutmaq üçün atı gəzdirmək.*

2. Birini özü ilə aparıb, ya onu müşayiət edib göstərmək. [Roza] *məni gəzdirib otaqları göstərirdi..* Çəmənzəminli.

3. Həmişə yanında saxlamaq, özü ilə birlikdə aparmaq. *Silah gəzdirmək.* – [Kərim baba] *tüfəngi hər zaman özü ilə gəzdirər və bir an yanından ayırmazdı.* A.Şaiq. *Axır bu dəftərləri portfelə yığıb qoltuğunda gəzdirməyin mənası nədir?* Qantəmir. // Üzük, saat və s. haqqında. *Saat gəzdirmək.*

4. Bir şeyi başqa bir şeyin üstündə dolandıraraq, hər tərəfinə səpmək. *Plova zəfəran gəzdirmək. Halvaya darçın gəzdirmək. – Sapılcanı hər iki qabın üzərinə gəzdirdi..* S.Rəhimov.

5. Bir şeyi başqa bir şeyin üstünə sürtmək, dolandırmaq. *Əlini uşağın belində gəzdirmək. – Möhsün müəllim əlini yuxarı daranmış sıx qara saçlarında gəzdirir.* S.Rəhimov. [İkram] *..dodaqlarını anasının üzündə gəzdirərkən qapıda səs-səmir eşidildi.* Ə.Əbülhəsən.

6. Bir sıra isimlərə qoşularaq mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: göz gəzdirmək, əl gəzdirmək.

**GƏZƏL** *is.* Nar qabığı (keçmişdə rəngboya almaq üçün işlənirdi). *Gəzəl əllərimi qaraldıb. – Şəhriyarın ürəyi də yarılmış bir nara bənzər; Tökülüb dənə sözləri, qalıb quruca gəzəli.* Şəhriyar.

**GƏZƏLİ** *sif.* Gəzəl rəngli, nar qabığına bənzər rəngi olan. *Paltarı gəzəli rəngdədir.*

**GƏZƏLLƏMƏ** "Gəzəlləmək"dən *f.is.*

**GƏZƏLLƏMƏK** *f.* Gəzəl suyunda boyamaq, nar qabığı ilə rəngləmək. *İpliyi gəzəlləmək.*

**GƏZƏN**[1] *is. köhn.* Gön kəsmək üçün keçmişdə başmaqçıların işlətdikləri iti alət, bıçaq.

**GƏZƏN**[2] *f.is.* 1. Hərəkət edən, yeriyən. *Gəzən xəstələr. – Gəzən ayağa daş dəyər.* (Ata. sözü). *Bu döyüşdü – əzilən var, əzən var; Ölüm hökmü qoltuğunda gəzən var.* M.Araz.

2. B a x **gəzəyən**. *Gəzən qadın. – Gəzən şələ bağlamaz.* (Ata. sözü).

**GƏZƏNƏ** b a x **gicitkən**.

**GƏZƏNGİ** *is. bot.* Əsasən badam ağacının tutulduğu xəstəlik; pas. *Badam bitkisi gəzəngi (pas), yarpaqların yanması, bürüşməsi və meyvələrin çürüməsi kimi xəstəliklərə tutulur.* İ.Axundzadə.

**GƏZƏNTİ** *sif.* Daim bir yerdən başqa yerə hərəkət edən, köçən.

**GƏZƏRGİ** *sif.* Başqa yerlərdə gəzərək işləyən, gəzərək özünə iş tapan; səyyar. *Gəzərgi fəhlə. Gəzərgi fotoqraf. Gəzərgi usta.* – [Dərviş:] *Ey Əhməd, dərviş gəzərgi olar.* (Nağıl).

**GƏZƏYƏN** *sif.* 1. Gəzməyi çox sevən, evdə oturmağa qərar tapmayan (qadın haqqında). *Gəzəyən qızdan gəlin olmaz.* (Ata. sözü). *Mollanın çox gəzəyən bir arvadı var imiş..* "M.N.lətif." *Camalın anası gəzəyən Pəri; Tələsmiş özünü saldı içəri.* H.K.Sanılı.

2. *məc.* Əxlaqca yüngül (qadın və ya kişi haqqında). // İs. mənasında. *Gəzəyənin biridir.*

**GƏZƏYƏNLİK** *is.* 1. Gəzəyən adamın xasiyyəti.

2. *məc.* Əxlaqca yüngüllük.

**GƏZİCİ** *sif.* Hərəkət edən, bir yerdə dayanmayan; gəzən. *Bu aralıq salam verən gəzici bir ixtiyar; Qoyun mən danışım, – dedi, – siz də edin tamaşa.* S.Vurğun.

**GƏZİLMƏ** "Gəzilmək"dən *f.is.*

**GƏZİLMƏK** *məch.* Axtarılmaq, soraq edilmək. *Zülfi-siyah içində sərgəştə könül itdi; Çinü Həbəş gəzildi, tapılmadı sorağı.* Q.Zakir.

**GƏZİNİŞ** b a x **gəzinti**.

**GƏZİNİŞMƏ** "Gəzinişmək"dən *f.is.*

**GƏZİNİŞMƏK** *f.* Birlikdə gəzinmək, dolanmaq (çoxları haqqında). *Uşaqlar gəzinişirlər.*

**GƏZİNMƏ** "Gəzinmək"dən *f.is.*

**GƏZİNMƏK** *f.* 1. Ağır-ağır yerimək, o baş-bu başa gəzmək, var-gəl eləmək. *Tamaşaçılar*

*foyedə gəzinirdilər. – Bahadır Sonanın dalınca diqqətlə baxdı, sonra xeyli vaxt otaqda gəzinib birdən oturdu.* N.Nərimanov. [Molla Xəlil] *o baş-bu başa gəzinir, qalın bir qaranlığa bürünən kəndə baxırdı.* S.Hüseyn. *Soltan bəy acıqlı-acıqlı ora-bura gəzinir.* Ü.Hacıbəyov.

2. Gəzmək, dolaşmaq. *Oba itlərini heç sevməzdim, çünki onların qorxusundan obada tək və azad gəzinə bilmirdim.* A.Şaiq. *Gəzinir gənc Osman əlində tüfəng; Baxır ulduzlara o körpə pələng.* H.K.Sanılı. *Dağların döşündə gəzinən çoban; Dərdlənib neyini çaldığı zaman...* S.Vurğun.

3. Bax **gəzişmək** 2-ci mənada. *Qüdrət sahildə nə qədər gəzindiyini bilmədi.* M.Hüseyn.

4. *məc.* Bir şeyin əlamətləri görünmək, zahir olmaq, nəzərə çarpmaq. *Bəxtiyarın tərdən işıldayan yanağında bir sevinc gəzindi.* M.Hüseyn.

**GƏZİNTİ** *is.* 1. Açıq havada əylənmək və istirahət etmək üçün miniklə, ya ayaqla yaxın yerlərə edilən səyahət; gəzişmə, seyr. *Meşə gəzintisi. Axşam gəzintisi. Səhər gəzintiyə çıxmaq. – Günəş yuvarlanır dağlar dalına; Qaralır göllərin gəzinti yeri.* S.Vurğun. *Sevindirdi uşaqları; Sahil boyu gəzintilər.* M.Dilbazi.

2. Açıq havada keçirilən kütləvi şənlik. *Parkda gəzinti təşkil olunmuşdur. Kütləvi gəzinti.* – [İnci:] *Gecə saat on ikidən sonra da parkda böyük bir gəzinti var.* S.Rəhman. [Gənclərin] *gəzintisinə əsas iş sahəsinin rəis müavini mühəndis Sultan Sultanov rəhbərlik edirdi.* Ə.Sadıq.

**GƏZİŞ** *is.* Gəzmə, yerimə tərzi. *Buna görə də Nənəqız Rizvanın yatışı, duruşu, gəzişi və gülüşünü heç bir an unutmurdu.* S.Rəhimov. // Gəzmə, gəzinti. *O axşam röyada gəzişə çıxdım; Aramızı vuran bir evi yıxdım.* S.Vurğun.

**GƏZİŞMƏ** "Gəzişmək"dən *f.is.*

**GƏZİŞMƏK** 1. Bax **gəzinmək** 1-ci mənada. *Dəhlizdə gəzişmək. – Mirzağa .. klubun böyükcə foyesində ağır addımlarla gəzişirdi.* S.Hüseyn. *Şəhərin məşhur taciri Hacı Xuduş otaqda o tərəf-bu tərəfə gəzişir.* H.Nəzərli.

2. *f.* Açıq havada istirahət və ya vaxt keçirmək məqsədilə gəzmək; gəzinmək. *Bağda gəzişmək. Parkda gəzişmək. – Yay fəslində, bir gün axşam çağında; Gəzişirdim Qız qalası dağında.* A.Səhhət. *Gəzişək qolqola sahil boyunca; Gəl-gəl Xəzərimin qırağına, gəl!* S.Rüstəm. [Yaşar] *ayağa durub gəzişsə idi, bəlkə bir qədər qızışardı.* M.Rzaquluzadə.

**GƏZLƏMƏ** "Gəzləmək"dən *f.is.*

**GƏZLƏMƏK** *f.* Şalbanın, ağacın, taxtanın və s.-nin ucuna haça açmaq; haçalamaq. *Taxtanı gəzləmək.*

**GƏZMƏ** "Gəzmək"dən *f.is.*

**GƏZMƏK** *f.* 1. Yerimək, dolaşmaq. *Müəllimə, bəs neçin bir-iki gündür biz əvvəlki kimi oxuya-oxuya kəndi gəzmirik?* C.Cabbarlı. *Uşaqlar çox vaxt qolsuz bir köynəklə yaşıl ot üstündə ayaqyalın gəzirlər.* Mir Cəlal. // Ümumiyyətlə, hərəkət etmək, hərəkətdə olmaq. – *Yenə açılmağa az qalıb səhər; Gəzir buludları keşik çəkənlər.* M.Rahim. *Sahil boyu düzülmüş fənərlərin əksi dənizdə gəzən yelkənli qayıqları işıqlandırırdı.* S.Rəhman.

2. Var-gəl etmək, o baş-bu başa gedib-gəlmək; gəzişmək, gəzinmək. *Eyvanda gəzmək. Həyətdə gəzmək.*

3. Səyahət etmək, hər yeri dolaşmaq. *O, bir çox ölkələri gəzmişdir.* – [Sənubər:] *Əlbəttə, bütün dünyanı gəzmək, görmək yaxşıdır.* B.Bayramov.

4. Seyrə çıxmaq, gəzintiyə getmək. *Vaxtilə qadınlar cümə günləri ziyarət adı ilə* [Pirvənzəriyə] *gəzməyə gedərdilər.* H.Sarabski.

5. Gəzərək baxmaq, gəzə-gəzə tamaşa etmək. *Muzeyi gəzmək. Xan sarayını gəzmək. – O günün sabahı, iclasdan əvvəl qurultay binasında təşkil edilmiş kənd təsərrüfat sərgisini gəzərkən Eldar* [Ceyrana] *yaxınlaşır.* S.Hüseyn.

6. Bir şeyi axtarmaq, hər yerə baxmaq. *Kitabların arasını gəzmək. Şkafı gəzmək.* – [Bayram:] *Ağa, bir sözümə qulaq as, mən bu yaxınlıqda ov gəzirdim.* M.F.Axundzadə. [Cahan:] *Vallah, gedərəm, dolanaram, gəzərəm, baxaram, bəyənərəm, seçərəm, bir qız alaram ki, adam baxanda ağlı gedər.* Ü.Hacıbəyov. // Axtarış aparmaq, axtarmaq. *Polislər gəzir, hər yeri addım-addım eşələyir*(*dilər*). S.Rəhimov.

7. Bir yerdən başqa yerə köçmək, çox yerə baş vurmaq. *Kəndbəkənd gəzmək. – Çox*

*gəzmişəm bu dünyanı oba-oba, oymaq-oymaq*; *Kim istəyir bu neməti öz əlindən yerə qoymaq?* S.Vurğun.

8. *məc.* Görüşmək, dostluq etmək, vaxt keçirmək, ünsiyyət bağlamaq. *Oğlan qonşu qızı ilə gəzir. – Əlbəttə, Eyvazla gəzdiyini bilsə də, anası* [Gülşənə] *bir söz deməzdi, çünki bu, təsadüfi görüş idi.* Ə.Vəliyev. // *məc.* Cinsi yaxınlıqda olmaq. *Tiflisdə oxuduğu və xidmət etdiyi zaman .. çox qızla gəzmiş.* Ə.Abasov.

9. *məc.* Vaxtını kefdə, əyləncədə, əyyaşlıqda keçirmək. [Qurban Nənəxanıma:] *Belə olmaz, gecənin yarısına kimi gəzməzlər, niyə demirsən, oğul, vaxtında evə gəl?!* Çəmənzəminli. [Gülcahan:] *O gedib gəzəcək, mən sənin üçün evdə qalıb qulluqçuluq edəcəyəm?* T.Ş.Simurq.

10. Keçmək, ötmək. *Ay gəzər, il dolanar, şənbə düşər Novruza.* (Ata. sözü).

11. Zahir olmaq, bir şeyin əlaməti görünmək, aşkar olmaq, özünü büruzə vermək. *Dodağında təbəssüm gəzirdi. – Məsumənin sifətində zəhrimardan acı bir gülüş gəzdi.* B.Bayramov.

12. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: dillərdə gəzmək, əldə gəzmək, kənar gəzmək.

**gəzə-gəzə** *zərf* 1. Gəzərək, yeriyə-yeriyə, hərəkət edə-edə. *Gəzə-gəzə danışmaq. – Rüstəm bəy otaqda gəzə-gəzə öz-özünə danışarkən qapı taqqıldadı.* Çəmənzəminli. *İndi professor xiyabanda tək-tənha gəzə-gəzə bunları da xəyalında dolandırırdı.* B.Bayramov.

2. Bir çox yerləri dolaşaraq, gəzərək. *Gəzə-gəzə kəndə çatdı. –* [Qarı:] *Gəzə-gəzə sən də gəldin buraya; Eşitdiyin şəhri-Tiflis buradır.* "Aşıq Qərib".

3. Yavaş-yavaş, ağır-ağır, tələsmədən yeriyə-yeriyə. *Gəzə-gəzə getmək. – Dəmirovgil gəzə-gəzə xırmanların üstünə tərəf gəlirdilər.* S.Rəhimov. [Qələndər:] *Qatar gecə yarısı gəlir. Dedim, elə piyada gəzə-gəzə gedərəm..* Q.İlkin.

**GİBBON** [*ing.*] Cənub-şərqi Asiya və Malay adalarında yaşayan uzunqollu meymun cinsi.

**GİC** *sif.* 1. Axmaq, səfeh, ağıldan kəm, sarsaq. *Qurbani der*: *bəsdir məni puç etdin; Aldın əqlim əldən, dəli, gic etdin.* Qurbani. *İslam gülə-gülə yavaş səslə* [Telliyə] *deyirdi*: *– Ay qız, gic olma!* S.Hüseyn. ☐ **Gic etmək (eləmək)** *məc.* – beynini yormaq, təngə gətirmək, bezikdirmək, çaşdırmaq, baş-beynini aparmaq.

2. *məc.* Yersiz, mənasız, qeyri-adi. *Mehribanı gic bir gülmək tutdu.* S.Hüseyn.

**GİCALOV** *is. dan.* Çətin, ağır, dolaşıq vəziyyət. *Mələk xanım bu gicalovda olsun, xəbər verim sənə Qara vəzirin qulunnan.* (Nağıl). **Gicalova düşmək** – 1) əl-ayağa düşmək, tələsik iş görmək; 2) çətinliyə düşmək, dolaşmaq.

**GİCAVAR** *is.* 1. *məh.* Tez-tez səmtini dəyişən yaz və ya yay küləyi. *Gicavar əsir.*

2. *məc. dan.* Əqidəsini, məsləyini tez-tez dəyişən adam haqqında; hərdəmxəyal. *Gicavarın biridir.*

**GİCBAŞ** b a x **gicbeyin**. [Çimnaz:] *Gicbaş arvad da Veys nə cür tapşırıb, elə-elə gedib qızı istəyib.* Ə.Əbülhəsən.

**GİCBAŞLIQ** b a x **gicbeyinlik**.

**GİCBEYİN** *sif.* Gic, axmaq, sarsaq, ağılsız.

**GİCBEYİNLİK** *is.* Giclik, axmaqlıq, sarsaqlıq, ağılsızlıq.

**GİCBƏSƏR** b a x **gicbeyin**.

**GİCBƏSƏRLİK** b a x **gicbeyinlik**. *Sən Seyid Vəlinin o gicbəsərliyinə baxma, onu nahaq yerə gözdən salıblar.* S.Rəhimov.

**GİCƏLLƏNDİRİCİ** b a x **başgicəlləndirici**.

**GİCƏLLƏNDİRMƏ** "Gicəlləndirmək"dən *f.is.*

**GİCƏLLƏNDİRMƏK: baş(ını) gicəlləndirmək** – gözlərini qaraltmaq, başını fırlatmaq. *Qırmızı, yaşıl, qara, sarı maykalar* [Lətifin] *gözündə bir-birinə qarışır, başını gicəlləndirirdi.* H.Seyidbəyli.

**GİCƏLLƏNMƏ** "Gicəllənmək"dən *f.is.*

**GİCƏLLƏNMƏK: baş(ı) gicəllənmək** – müvazinət hissinin itirilməsi, gözlərin qaralması və başın hərlənməsi şəklində təzahür edən yarıbayğınlıq halında olmaq. [Yaşlı kişi:] *Burada, məsciddə kəsafətdən adamın başı gicəllənirdi.* S.Hüseyn. *Sədrin sözündən Verdiyevin başı gicəlləndi.* Mir Cəlal. *Səhər*

*qatardan düşəndə yenə başım gicəlləndi, yerə yıxıldım.* H.Seyidbəyli.

**GİCƏLLƏTMƏ** "Gicəllətmək"dən *f.is.*

**GİCƏLLƏTMƏK** bax **gicəlləndirmək**. *Zərbə onu gicəllətdi.*

**GİCƏLMƏ¹** "Gicəlmək¹"dən *f.is.*

**GİCƏLMƏ²** "Gicəlmək²"dən *f.is.*

**GİCƏLMƏK¹** bax **gicəllənmək**. *..Əgər yer fırranır, bəs niyə bizim başımız gicəlmir?* C.Məmmədquluzadə. [Molla Nəsrəddin:] *..Başım gicəlib hərlənirdi.* A.Divanbəyoğlu. [Zaman:] *Xurşid xanım, bu yazığın* [Turacın] *belbağısını götürmüşsən, axtarmaqdan yazığın başı gicəlir.* C.Cabbarlı.

**GİCƏLMƏK²** *qayıd.* Gic olmaq, dəli olmaq, başına hava gəlmək. [Almaz:] *Gicəlmisən qız nədir?* C.Cabbarlı.

**GİCƏLTMƏ¹** "Gicəltmək¹"dən *f.is.*

**GİCƏLTMƏ²** "Gicəltmək²"dən *f.is.*

**GİCƏLTMƏ³** *is.* Qoyun-quzuda baş gicəllənməsi şəklində təzahür edən xəstəlik. *Maldarlıq edən şəxslərə məlumdur ki, qoyun-quzuda bir gicəltmə naxoşluğu olur ki, onlar bir yerdə fırlanıb, yıxılıb fövt olurlar.* "Əkinçi".

**GİCƏLTMƏK¹** bax **gicəlləndirmək**. *..Tənbəkidə nikotin adlı şey var ki, adamın başını gicəldir, qusmağı gəlir, əl-ayağı titrəyir.* H.Zərdabi.

**GİCƏLTMƏK²** *f.* Gic etmək, dəli etmək.

**GİCGAH** *is.* [*fars.*] Kəllənin qulaqdan alın sümüyünə qədər olan hissəsi. *Daş gicgahına dəydi. Gicgahını ovuşdurmaq.* – [Qarı:] *..Mürdəşir Səkinə nağıl eləyirdi ki, Güləndamın gicgahına qan saçılmışdı.* Çəmənzəminli. [Bahadır] *bu sözləri yazandan sonra tapançanı gicgahına qoyub sıxdı.* N.Nərimanov.

**GİC-GİC** *zərf* Gic kimi, axmaqcasına, sarsaq-sarsaq, mənasız olaraq. *Gic-gic gülmək.* – [Sitarə Gülzara:] *Bəsdir, bəsdir. Yenə gic-gic danışma.* C.Cabbarlı. [Fatma:] *Gic-gic danışma, özün bilirsən ki, o, birinci dərəcəli şoferdir.* S.Vəliyev.

**GİCİK** *is.* Gic, axmaq, sarsaq, dəli.

**GİCİKMƏ** "Gicikmək"dən *f.is.*

**GİCİKMƏK** *f.* Gicləşmək, gic olmaq, axmaqlaşmaq, sarsaqlaşmaq.

**GİCİŞDİRMƏ** "Gicişdirmək"dən *f.is.*

**GİCİŞDİRMƏK** *icb.* Gicişmə hissi doğurmaq, qıcıqlandırmaq, qaşındırmaq, təxərrüşə gətirmək. *..Sarıköklü pitinin ətri çayxanaya dolmağa və Qədim dayının burnunu gicişdirməyə başladı.* S.Rəhimov.

**GİCİŞMƏ** 1. "Gicişmək"dən *f.is.*

2. *is.* Bədənin hər hansı bir yerində dərinin həssaslığının pozulması nəticəsində əmələ gələn qeyri-ixtiyari qaşınma ehtiyacı. *Bədənində gicişmə var.*

**GİCİŞMƏK** *f.* Qaşınmaq, qaşınma duymaq, qaşıntı hiss etmək. *Keçinin buynuzu gicişəndə başını çobanın çomağına sürtər.* (Ata. sözü). *Ovcumun içi yaman gicişirdi.* M.Hüseyn. *Bir sözlə* [Nərminənin] *əl-ayağı gicişir, sinəsi özünə aydın olmayan bir hissin təsiri ilə qalxıb-enirdi.* B.Bayramov.

**GİCİTKƏN** *is. bot.* Gövdə və yarpaqlarında dalayıcı tükləri olan ot bitkisi; gəzənə. *Böyük bir səadət isə bu yerlərin cincilim, gicitkən kimi otlarla dolu olması idi.* S.Vəliyev.

**GİCİTKƏNLİK** *is.* Çoxlu gicitkən bitən yer.

**GİCLƏŞMƏ** "Gicləşmək"dən *f.is.*

**GİCLƏŞMƏK** *f.* 1. Gic olub getmək, axmaqlaşmaq, səfehləşmək, ağlı itmək. *O getdikcə gicləşir.*

2. Axmaq hərəkətlər etmək, gic-gic danışmaq, yersiz iş görmək; axmaqlamaq, səfehləmək.

**GİCLİK** *is.* 1. Axmaqlıq, səfehlik, sarsaqlıq. *Giclik eləmək.*

2. Axmaq hərəkətlər, axmaq danışıq.

**GİCO** *is. dan.* Burulğan.

**GİCTƏHƏR** *sif.* Bir az gic, axmaq, gicbəsər, gic kimi. *Gictəhər adam.* – *Qulu həmişəki kimi gictəhər* (z.) *və laqeyd görünürdü.* M.İbrahimov.

**GİCTƏHƏRLİK** *is.* Gicə oxşama; bir qədər giclik, sarsaqlıq, gicbəsərlik.

**GİDİ** *sif.* Pis, alçaq, yaramaz. *Gidi Reyhan ərəb atı gətirməz; Aşa bilməz qarlı dağlar, yol, məni.* "Koroğlu".

◊ **Gidi** yaxud **gidi-gidi dünya** – etibarsız dünya. [Fəhlələrdən biri:] *Hə, indi bizi özünə qardaş elədin? Dünənə kimi yanından keçmək olmurdu. Ay gidi dünya ha!..* M.Hüseyn. [Cahandar ağa] *dərindən köksünü ötürdü:*

*"Ay gidi dünya, gör axırın hara gəlib çıxdı".* İ.Şıxlı.

**GİGİRTDƏMƏ** "Gigirtdəmək"dən *f.is.*

**GİGİRTDƏMƏK** *f.* İki adamı qızışdırıb aralarını vurmaq.

**GİGİYÉNA** [*yun.* hygieinos – şəfaverici] Xarici mühitin müxtəlif amillərinin insan orqanizminə təsirini və sağlamlığı qoruma tədbirlərini öyrənən elm. *Gigiyena qaydaları.* // Sağlamlığı qoruyan təcrübi tədbirlərin məcmusu. *Əmək gigiyenası.*

**GİGİYENAÇI** *is.* Gigiyena mütəxəssisi olan həkim.

**GİGİYENÍK** *sif.* 1. Gigiyenaya aid olan, gigiyena ilə əlaqədar olan. *Gigiyenik tədbirlər.*

2. Gigiyena qayda və tələblərinə cavab verən. *Gigiyenik kostyum.*

**GİGOVUN** b a x **mozalan**.

**GİQÁNT** [*yun.*] Çox böyük, çox iri, nəhəng, azman.

**GİQANTLIQ** *is.* Böyüklük, yekəlik, nəhənglik, azmanlıq.

**GİQANTÍZM** [*yun.*] *biol.* Çox böyük sürətlə boy ataraq mövcud normalardan kənara çıxma (insan, heyvan və ya bədənin ayrı-ayrı üzvləri haqqında).

**GİL** *is.* 1. Yer səthində və ya altında olan, yaş halda özlü kütləyə çevrilən çöküntü süxuru (dulusçuluq, heykəltəraşlıq və tikintidə işlədilir). *Qırmızı gil. Gil məhlulu. – Çökmə süxurların dənizdə əmələ gələn növlərinə misal olaraq qumaşı, əhəngdaşı, gil və s. göstərmək olar.* M.Qaşqay. [Sərvinaz davam etdi:] *Bu gübrə gilin bir növüdür.* Ə.Vəliyev.

2. *dan.* b a x **gilabı**.

**GİLABI** *is.* [*fars.*] Keçmişdə paltar və baş yumaq üçün sabun əvəzinə işlədilən gil növü. *Sarı gilabı. Göy gilabı. – Keçmişdə kənd və şəhərlərdə sabun çatışmayan zaman gilabı ilə paltar yuyur və çimirdilər. Gilabı sabunu əvəz edirdi.* M.Qaşqay. *Göy və sarı gilabı ilə baş yuyardılar.* H.Sarabski. *Çay qırağındakı yamaclardan paltar yumaq üçün gilabı deyilən palçıq çıxırdı.* Ə.Əbülhəsən.

**GİLABISATAN** *is. köhn.* Keçmişdə əyalətləri gəzərək gilabı satmaqla məşğul olan adam. *Gilabısatan xüsusi yoxsul adamlar olardı.* H.Sarabski.

**GİLAN** *is. məh.* Qapını bağlamaq üçün arxasına keçirilən taxta və ya dəmir; kilid.

**GİLAS** *is.* Ağ, sarı, qırmızı və qara növləri olan çəyirdəkli şirin meyvə və bu meyvənin ağacı. *Gilas mürəbbəsi. Gilas şirəsi. – Zeynəb qarı da gilas və ərik qaxı qurudurdu.* S.S.Axundov. [Mehrəli] *..gilas ağacından qayrılmış uzun müştüyünü üfləyib, papirosu ucuna qondardı.* Çəmənzəminli. *Bağımda gilas dəydi; Gül açdı, gilas dəydi; Yar əlindən ox çıxdı; Sinəm üstə rast dəydi.* (Bayatı).

**GİLASLIQ** *is.* Çoxlu gilas ağacı əkilmiş yer; gilas bağı. *Gilaslığı suvarmaq.*

**GİLAVAR** *is.* Cənub və cənub-şərqdən əsən külək adı. *Əsdikcə gilavar, oynardı bulvar.* M.Müşfiq. *Şiddətli bir gilavar* (*cənub küləyi*) *əsdiyindən dənizin gurultusu eşidilirdi.* S.Hüseyn. *Asta əsən gilavar ruzgarın sərin dalğalarını sahildəki evlərin içərisinə gətirirdi.* B.Talıblı.

**GİLDİR-GİLDİR** *zərf* Gilə-gilə, damcı-damcı, dənə-dənə (göz yaşı haqqında). *Gildir-gildir yaş tökmək. Gildir-gildir ağlamaq. – Tökərək gözlərindən gildir-gildir yağışlar; Məni qurtar, deyirdi, o yalvaran baxışlar.* S.Rüstəm. *Kişi əmlli-başlı ürəkdən ağlayır, gildir-gildir göz yaşı tökürdü.* İ.Hüseynov.

**GİLDİYA** *is.* [*alm.*] İttifaq, təbəqə.

**GİLEY** *is.* Narazılıq, şikayət. *Nə xoş sitəmkarsan, zalimü xunxar; Onun üçün səndən çox gileyim var.* M.P.Vaqif. *Mənim günahım çox, sənin gileyin; Onların nəhayət zamanı deyil.* Q.Zakir. *Bəyimin ərki və gileyi Məmməd bəyi oxşadı.* Çəmənzəminli. ☐ **Giley etmək (eləmək)** – şikayətlənmək, narazılıq etmək. *Məktub sahibi gəldi idarəyə və ruznamənin təxirindən başladı giley eləməyə.* C.Məmmədquluzadə. *Giley etdikdə sənə, üz çeviribsən məndən; Gileyim var nə qədər səndən, a canan, sorma.* Şəhriyar.

**GİLEY-GÜZAR** b a x **giley**. [Fazil:] *Abbas, genə səndən yana giley-güzar eşidirəm, genə səndən şikayətlər qulağıma çatır.* C.Məmmədquluzadə. *Çimnaz xalanın giley-güzarı* [Xəlilin] *könlünə toxunmadı.*

M.Hüseyn. *Giley-güzar beynimizi dəlməsin; Gəlin, dostlar, məhəbbətdən danışaq.* R.Rza.

**GİLEY-GÜZARLIQ** *is.* Narazılıq, şikayət. [Mürşid:] *Sadıq, bizim arvad məndən çox giley-güzarlıq elədi?* S.Rəhman.

**GİLEY-KÜSÜ** b a x **giley-güzar**. *Danışdıqca Zeynəbin səsi titrəyirdi, bu titrəyişdə həm dərin bir iztirab, həm də incə giley-küsü vardı.* M.İbrahimov.

**GİLEY-KÜSÜLÜK** b a x **giley-güzarlıq**.

**GİLEYLƏNMƏ** "Gileylənmək"dən *f.is.*

**GİLEYLƏNMƏK** *f.* Giley etmək, şikayətlənmək, narazılıq etmək. *Kəndlilər südün azlığından şikayət edir, çobanlardan gileylənirdilər.* M.Hüseyn. *Onlar yenicə evlənmişdilər. Məni toylarına çağırmadıqlarına gileyləndim.* M.İbrahimov.

**gileylənə-gileylənə** *zərf* Şikayətlənərək, narazılıq edərək. [Hümmət:] *Küncdə-bucaqda danışmaq arvad işidir, – deyə, astadan gileylənə-gileylənə eyvana çıxdı.* B.Bayramov.

**GİLEYLİ** *sif.* və *zərf* Narazı, şikayətçi. *Oturuşu şirin, duruşu Leyli; Qəmzəsi öpməli, yarı gileyli.* M.P.Vaqif. *Dünyada hədsiz şəxslər avamdan gileyli qalıblar.* C.Məmmədquluzadə. *Şirin sözlərini başa düşməyən; Öz elin olmazmı səndən gileyli?* B.Vahabzadə.

**GİLEYLİK** b a x **giley**. *Şərifzadə ondan gileylik eyləyirdi.* M.Hüseyn.

**GİLƏ** *is.* 1. Üzümün, narın və s. meyvələrin hər bir dənəsi. *Qarağat giləsi.* – [Kazım] *yoğun qaşlarının altından baxan xırda üzüm gilələrinə oxşar gözlərini bərəldib dedi..* Çəmənzəminli. *Kəhrəbadan seçilməz salxımlar nəzərində; Ağzında şaqqıldayıb hər giləsi bal dadır.* S.Rüstəm. *Narın birini kəsdim, zoğal kimi iri, əqiq kimi duru gilələri var idi.* Mir Cəlal.

2. Damla, damcı. *Bir gilə su. Yaş giləsi. – Cümşüd bəy əlini açdı, qulluqçu onun ovcuna bir neçə gilə gülab tökdü.* E.Sultanov. [Müqim bəy:] *Daşdəmir oğlunun başını gərək elə kəsəsən ki, heç bir gilə qanı da yerə düşməyə!* S.Rəhimov. *Bir gilə götürüb hər bulağından; Gətirib evimdə bulaq düzəldəm...* M.Araz.

3. Gözün qüzeh qişasında olan və oradan gözün içinə işıq daxil olan kiçik deşik. *Mən aşiq giləsinə; Üzümün giləsinə; Qoy durum, qurban olum; Gözlərin giləsinə.* (Bayatı). *Musa kişi dərinlərə getmiş, təkcə giləsi işıldayan gözlərini qırpdı.* M.İbrahimov. [Kərimov Səfərliyə:] *Görürsən ki, bu ağ yavaş-yavaş böyüyüb nəhayət gözün giləsini örtür.* H.Seyidbəyli.

4. Məmənin ucu. *Döşün giləsi. – Nahar eyləyəndə sızlardı hərdən; Döşünün giləsi, döşünün ucu.* B.Vahabzadə.

**GİLƏKCƏ** *sif.* və *zərf* Gilək dilində. *Giləkcə bilmək.* – [Kişi və arvad] *giləkcə danışırdılar.* S.Hüseyn.

**GİLƏ-GİLƏ** *zərf* Damcı-damcı, damla-damla. *Su gəlir gilə-gilə; Bülbüllər gəlir dilə; Yarımı bağda gördüm; Batıbdır qızılgülə.* (Bayatı). *Mum əriyir, gilə-gilə axır aşağı; Şam ağlayır həzin-həzin, sakit yaş axır.* R.Rza.

**GİLƏKLƏR** *is.* İranın şimalında, Xəzərin cənub sahilində yaşayan, İrandilli kiçik bir xalq.

**GİLƏLƏMƏ** "Giləələmək"dən *f.is.*

**GİLƏLƏMƏK** *f.* Üzümün, narın və ya başqa giləmeyvənin gilələrini bir-bir qırmaq, qoparmaq. *Narı giləələmək. Qarağatı giləələmək.* – [Molla] *əlinə bir salxım üzüm alıb giləələyir.* "M.N.lətif."

**GİLƏLƏNMƏ** "Giləələnmək"dən *f.is.*

**GİLƏLƏNMƏK** *məch.* 1. Gilələri bir-birindən ayrılmaq, qoparılmaq, gilə halına salınmaq. *Üzüm sirkə üçün giləələndi.*

2. Gilə halına düşmək; yumrulanmaq, damcılanmaq. *Nənəqızın gözlərində həyəcanlı göz yaşları giləələndi, o, Rüxsarənin vəziyyətinə baxıb daha da şübhələnməyə başladı.* S.Rəhimov. *Gözü qapananda sol yanağında; Gördülər bir damla yaş giləələndi.* B.Vahabzadə. [Bəhlul:] *Gözlərimdə yaş giləələndiyini hiss elədim.* B.Bayramov.

**GİLƏMEYVƏ** *is. bot.* Gilə şəklində bitən meyvələrin (məs.: üzüm, moruq, qarağat və s.) ümumi adı.

**GİLƏMEYVƏÇİLİK** *is.* Meyvəçiliyin, giləmeyvə bitkilərini əkib-becərməklə məşğul olan sahəsi. *Giləmeyvəçilik təsərrüfatı.*

**GİLƏMEYVƏLİLƏR** *cəm bot.* Üzüm, moruq, qarağat və bəzi başqa meyvələrin daxil olduğu bitkilər.

**GİLƏNAR** *is.* 1. B a x **albalı**. *Hər evin həyətində .. gilənar ağacları .. var.* İ.Əfəndiyev.

2. *məc.* Qara, girdə göz haqqında. *Gilənar gözlü qız hamıya gülümsəyən gözlərini oynatdı.* M.İbrahimov.

**GİLƏNARLIQ** *is.* Çoxlu gilənar ağacı əkilmiş yer; gilənar bağı. *Binanı əhatə edən bağ alma-armudluqdan, gilənarlıqdan ibarət idi.* S.Rəhimov.

**GİLGİLƏ** *is.* Nazik, ensiz dəmirdən, ya ağacdan olan çənbər və onu gillətməkdən ötrü uzun ağacdan və ya məftildən ibarət uşaq oyuncağı. // Bu oyuncaqla oynanılan uşaq oyunu.

**GİLİZ** [*alm.*] ("gilza" sözünün canlı dildə tələffüzü). 1. Odlu silahlarda: alt hissəsində barıt və yandırıcı maddə, yuxarı hissəsində isə güllə və ya mərmi yerləşən altı bağlı silindrik borucuq. *Deyib göstərdi o, iki berdanı; içində gilizi, üstündə qanı.* H.K.Sanılı. *Mahmud əlindəki boş gilizi döşəməyə sərilmiş yağlı əsginin üstünə atıb, eşiyə yüyürdü.* M.Hüseyn.

2. Papirosun, içi tütünlə doldurulan kağız patronu. *Giliz doldurmaq. Giliz qutusu.*

**GİLQARIŞDIRAN, GİLQARIŞDIRICI** *sif. xüs.* Tikinti işlərində gil məhlulu hazırlamaq üçün gili su ilə qarışdıran. *Gilqarışdıran qurğu.* // *is. mənasında.* Gil məhlulu hazırlamaq üçün gili su ilə qarışdıran maşın. *Maşınqayırma zavodundan .. gilqarışdıranlar ixrac edilir.* (Qəzetlərdən).

**GİLLƏ** *is. məh.* Təndirdə alma və ya armud qaxı qurutmaq üçün dayaz palçıq qab.

**GİLLƏDİLMƏ** "Gillədilmək"dən *f.is.*

**GİLLƏDİLMƏK** *məch.* Diyirlədilmək, yumaladılmaq.

**GİLLƏMƏ¹** "Gilləmək¹"dən *f.is.*

**GİLLƏMƏ²** "Gilləmək²"dən *f.is.*

**GİLLƏMƏK¹** *f.* Diyirləmək, yumalatmaq.

**GİLLƏMƏK²** *f.* Gil vurmaq, gil sürtmək, gillə suvaq çəkmək. *Divarı gilləmək.*

**GİLLƏNMƏ¹** "Gillənmək¹"dən *f.is.*

**GİLLƏNMƏ²** "Gillənmək²"dən *f.is.*

**GİLLƏNMƏK¹** *f.* Fırlana-fırlana düşmək, diyirlənmək. *Nigarın ala gözlərindən damcı-damcı yaş gillənib lalə yanaqlardan aşağı gəldi.* "Koroğlu". *Cüyür qaçar, daş gillənər; Bu dağlarda, bu dağlarda.* B.Vahabzadə.

**GİLLƏNMƏK²** *f.* 1. Gillə qarışmaq, gilli olmaq; gillə örtülmək, gil halına düşmək. *Neft layı gillənib.*

2. Gil vurulmaq, gil çəkilmək, gillə suvaq çəkilmək.

**GİLLƏTMƏ¹** "Gillətmək¹"dən *f.is.*

**GİLLƏTMƏ²** "Gillətmək²"dən *f.is.*

**GİLLƏTMƏK¹** *f.* Yuvarlatmaq, diyirlətmək. *Şalbanı gillətmək. Çəlləyi gillətmək.*

**GİLLƏTMƏK²** *icb.* Gil vurdurmaq, gil sürtdürmək, gillə suvaqlatmaq. *Divarı gillətmək.*

**GİLLƏŞMƏ** "Gilləşmək"dən *f.is.*

**GİLLƏŞMƏK** b a x **gillənmək** 1-ci mənada.

**GİLLİ** *sif.* Tərkibində gil olan, gil qatışmış, gil qarışıq. *Gilli torpaq. Gilli məhlul. Gilli süxur. – O daşlı, qumsallı, gilli torpağı; Udur, lay-lay udur ekskavatorlar.* S.Vurğun.

**GİLLİCƏ** *is. geol.* Tərkibində gil olan (torpaq).

**GİLLİCƏLİ** *sif. geol.* Tərkibində gillicə çox olan. *Gillicəli torpaq.*

**GİLLİLİK** *is.* Tərkibində gil olma. *Torpağın gillilik dərəcəsi. Qumun gilliliyi.*

**GİLYOTÍN** [*fr.* xüs. addan] *tar.* Ölüm cəzasına məhkum olanların başını kəsmək üçün maşın. *O yandan ərş mülkü və kosmosun qamarlanması; Bu yandan gilyotin və qətl aləti! O, ruzigarın gilyotini, bu raketlər; Pərdənin dalında da namərdin soyuq müharibəsi!* Şəhriyar.

**GİMGƏ** *is. dan.* Yığıncaq, yığnaq, bir yerə yığılmış adamlar. *Küçədə gimgə qurmaq. – Bünyadın gözündən itən cani bir doqqaz qabağında yığılan gimgəyə yaxınlaşırdı.* Ə.Əbülhəsən.

**GİMNÁST** [*yun.*] Gimnastika ilə məşğul olan, gimnastikada mahir olan idmançı. *Gənc gimnastlar. Gimnast qızlar.*

**GİMNASTÍK** *sif.* Gimnastikaya aid olan, gimnastika ilə əlaqədar olan. *Gimnastik hərəkətlər.*

**GİMNÁSTİKA** [*yun.*] Orqanizmi inkişaf etdirmək və sağlamlaşdırmaq üçün tətbiq edilən xüsusi fiziki hərəkətlər sistemi. *Səhər gimnastikası.*

**GİMNASTYÓRKA** [*rus.*] Düz dayanan yaxalıqlı üst köynəyi (hərbi geyim). *Gimnastyorkanı ütüləmək. – Qərargah rəisi – uzun, qarayanız adam gimnastyorkasını tərsinə geyərək .. telefon aparatına tərəf cumdu.* S.Vəliyev.

**GİMNAZÍST** [*yun.*] 1917-ci il inqilabından əvvəl: gimnaziya şagirdi. *Bazara çıxdıqda Cənnətəli gimnazistləri başına toplardı.* Çəmənzəminli. *Bu zaman içəridən 15-16 yaşlarında, əynində gimnazist paltarı olan qırmızıyanaq bir oğlan çıxdı.* Q.İlkin.

**GİMNÁZİYA** [*yun.*] Klassik dillərin tədrisinə üstünlük verilən orta məktəb. *Knyaza gimnaziyanın köhnə və sərt qaydaları çox ağır gəlir.* F.Köçərli. *Bahadır .. gimnaziyanı qurtarandan sonra yenə oxumaqdan əl çəkməyib istədi ki, atasından adına qalan yeri ucuz qiymətə satıb universitetə getsin.* N.Nərimanov. *Hacı Əsgərin iki oğlu .. gimnaziyada oxuyurlar.* S.M.Qənizadə.

**GİNEKOLÓGİYA** [*yun.* gyne – qadın və logos – elm] *tib.* Qadın orqanizminin xüsusiyyətləri, qadın cinsi orqanları və onların müalicəsi haqqında elm. *Ginekologiya kafedrası.*

**GİNEKOLOJÍ** *sif.* [*yun.*] Ginekologiyaya aid olan, ginekologiya ilə əlaqədar olan. *Xəstəxananın ginekoloji şöbəsi.*

**GİNEKÓLOQ** [*yun.*] Qadın xəstəlikləri həkimi, ginekologiya mütəxəssisi.

**GİPGİRDƏ** *üst.* Lap girdə, tamamilə girdə; yuvarlaq. *Gipgirdə şar.*

**GİPS** [*yun.*] 1. Ağ və ya sarı rəngli mineral; kirəc (yandırılıb xırdalanmışı tikinti materialı kimi heykəltəraşlıqda, cərrahlıqda işlədilir). *Gips yatağı. Suvaqlıq gips. // xüs.* Həmin mineraldan (kirəcdən) düzəldilmiş. *Dibçəklərin aralarında tunc, mərmər və gips heykəllər dururdu.* M.Süleymanov.

2. *tib.* Sınmış, çıxmış sümükləri bitişdirmək və bədənin zədələnmiş hissəsinin hərəkətsizliyini təmin etmək üçün həmin mineraldan düzəldilən möhkəm sarğı. *Gips qoymaq. Ayağı bir aydır gipsdədir. Gipsi çıxarmaq. Gipsə salmaq* (*gipsdən hazırlanmış sarğı ilə bağlamaq*).

**GİPSLƏMƏ** "Gipsləmək"dən *f.is.*

**GİPSLƏMƏK** *f.* 1. Gips sarğısı qoymaq. *Qolunu gipsləmək.*

2. *k.t.* Torpağı gipslə gübrələmək.

3. *xüs.* Rəngini və dadını yaxşılaşdırmaq, habelə xarab olmaqdan qorumaq üçün üzüm şərabına gips əlavə etmək. *Şərabı gipsləmək.*

**GİPSLƏNMƏ** "Gipslənmək"dən *f.is.*

**GİPSLƏNMƏK** *məch.* 1. Gips sarğısı qoyulmaq. *Əli gipslənib.*

2. *k.t.* Yanmamış, üyüdülmüş gipslə gübrələnmək (*torpaq haqqında*).

3. *xüs.* Rəngini və dadını yaxşılaşdırmaq, habelə xarab olmaqdan qorumaq üçün üzüm şərabına gips əlavə edilmək. *Şərab gipslənib.*

**GİPSLƏTMƏ** "Gipslətmək"dən *f.is.*

**GİPSLƏTMƏK** *icb.* 1. Gips sarğısı qoydurmaq. *Ayağını gipslətmək.*

2. *k.t.* Yanmamış, üyüdülmüş gipslə gübrələtmək. *Torpağı gipslətmək.*

**GİPSLİ** *sif.* Tərkibində gips olan. *Gipsli torpaq.*

**GİPSLİLİK** *is.* Tərkibində gips olma. *Torpağın gipslilik dərəcəsi.*

**GİPSOLİT** [*yun.*] Gipslə müxtəlif maddələrin qarışığından hazırlanan tikinti materialı (arakəsmə və s. üçün işlədilir). *Gipsolit arakəsmə.*

**GİPÜR** [*fr.*] Qabarıq naxışları olan çox zərif krujeva növü. // Krujeva kimi toxunmuş parça. // Həmin parçadan tikilmiş. *Gipür kofta. Gipür paltar.*

**GİR** *is.* [*fars.*] Güc, qüvvət, taqət. *Əlinin giri yoxdur. Qolunun giri. – Tüfəngini qaparaq; Yalınayaq çaparaq; Güvənib öz girinə; Qoşdu döyüş yerinə.* M.Rahim. ☐ **Girdən düşmək (getmək)** – qüvvətdən düşmək, gücdən düşmək, taqəti kəsilmək. [Adil:] *Atam cəbhədən tayqılça, qolunun biri də girdən düşmüş halda qayıtdı.* B.Bayramov.

◊ **Girə düşmək** – b a x **girə keçmək**. *Kamil usta, oturgilən yerinə; Lovğalanıb düşmə mənim girimə.* "Aşıq Qərib". *Özün öz əlinlə düşdün girimə; Haqdan sana bir bəlayəm, sən nəsən?* Abdal Valeh. [Mirzə Kərim:] *Hərgah mənim dediklərimə əməl olunsaydı, girə də düşməzdin.* Ə.Haqverdiyev. **Girə keçmək** – tora düşmək, tələyə düşmək, ələ keçmək, tutulmaq. [Tağı:] *Rəhim xanın adamları indi bizi axtarmamış yer qoymayıblar. Qorxuram yoldaşlarımız girə keçələr.* Ə.Haqverdiyev. [Ələmdar] *..girə keçən dələduzları buraxdırıb qənimətin yarısını, bəzən də hamısını qamarlayıb götürərdi.* S.Rəhimov. **Girə salmaq** – b a x **girə vermək**. *Əcəl səni salıb əcəb bu girə; Sənin də*

*gərdənin keçər zəncirə.* Aşıq Həsən. **Girə vermək** – ələ vermək, tora salmaq. *İndi* [Hatəmxan ağagil] *üçün bu üstüörtülü ədavət pərdəsini yırtmaq – öz əli ilə .. onu girə vermək* (demək) *idi.* S.Rəhimov. **Girinə gəlmək** – əlinə gəlmək. *..A kişi, tez özünü yetir .. bəlkə heç olmasa o puldan üç il bundan irəli ianə qəsdi ilə yığılan pul qədəri girinə gələr.* "Mol. Nəsr."; // işinə yaramaq. **Girinə keçmək** – əlinə keçmək (düşmək). [Koroğlu:] *Cəfər paşa, get, .. bir də girimə keçsən öldürəcəyəm.* "Koroğlu". [Sultan bəy:] *Zalım oğlu arşınmalçının xalası yaxşı girimə keçmişdi, olmadı.* Ü.Hacıbəyov. *Səhərdən Salman Rüstəm kişinin girinə keçməmişdi. Hara ayaq basırdı, deyirdilər, elə indicə bu tərəfə getdi.* M.İbrahimov.

**GİRAMİ** *sif.* [*fars.*] *klas.* Əziz, istəkli, hörmətli. (danışıqda adətən "əziz-girami" şəklində işlənir). *Əziz-girami uşaq. – Demə Zakir, ki səni yar girami tutmaz; Nə münasib tuta hər bisərü-samanı əziz.* Q.Zakir.

**GİRDAB** *is.* [*fars.*] 1. Bax **burulğan** 1-ci mənada. *..Gah sahil, gah girdab olur məskənim; Nə qədər bəlalı başım var mənim!* A.Şaiq. *Gah olur ki, cəbhə yarıb ordular basan; Bir igidi kiçik bir çay girdaba salır.* S.Vurğun. *Sabah qışsız, boransız bir həyat qurulanda; Bu girdabın suları aynatək durulanda..* R.Rza.

2. *məc.* Ağır, qorxulu hal, həyatın keşməkeşi, çıxılmaz vəziyyət. *Noldu qəmimə gətirmədin tab; Qorxutdu məgər səni bu girdab?* Füzuli. *Batıb burulğana itir gözündən; Həyatın da belə girdabları var.* O.Sarıvəlli.

**GİRDABLI** *sif.* 1. Girdabı olan, burulğanlı. *Girdablı dəniz.*

2. *məc.* Ağır, təhlükəli, əzablı, çıxılmaz. *Həyatın girdablı yolları.*

**GİRDƏ** *sif.* 1. Dairəvi, dairə şəkilli. – *Mən Əhmədə otağın qarşısındakı girdə mizin dövrəsində olan sandalyalardan birində əyləşməyi təklif etdim.* T.Ş.Simurq. *Ənqa quşunun iri girdə gözlərində bərkiyən damlalar ağırlaşanda quşun gözlərindən qopub üzüaşağı yuvarlanırdı.* Ə.Məmmədxanlı.

2. Yumru, yuvarlaq, şarşəkilli. *Girdə alma. Girdə həb.* – [Kərbəlayı Zal öz-özünə:] *"Daha baxtımın ulduzu parıldadı. Gecənin bu vaxtında gələn girdə şey xatalı şey ola".* Ə.Haqverdiyev.

3. Yastıboy, kök adam haqqında. *Qədir çarığının ucu ilə girdə kişinin ayağına toxunub him elədi*: *– Adam var!* Mir Cəlal.

**GİRDƏCƏ** *sif.* Çox girdə; gipgirdə, yumruca. *Girdəcə sifət. – Rizvan iki yaşında*; *Bir uşaqdır girdəcə.* M.Dilbazi.

**GİRDƏDİŞLİ** *sif. tex.* Dişləri girdə, dairəvi olan. *Girdədişli val.*

**GİRDƏGÖZ(LÜ)** *sif.* Gözləri girdə olan. *Girdəgözlü uşaq. – ..Balacaboy, girdəgöz, dörd-beş yaşlı oğlan boğazını uzadıb kəkələdi*: *– Qağasıdır.* M.İbrahimov.

**GİRDƏLƏMƏ** "Girdələmək"dən *f.is.*

**GİRDƏLƏMƏK** *f.* 1. Girdə etmək, girdə şəklə salmaq, yumrulamaq, şar şəklinə salmaq, yuvarlaqlamaq.

2. Dairə şəklinə salmaq, dairəviləşdirmək, dairəvi etmək. *Dodaqlarını girdələmək.*

**GİRDƏLƏNMƏ** "Girdələnmək"dən *f.is.*

**GİRDƏLƏNMƏK** *f.* 1. Yumrulanmaq, şar şəklinə düşmək.

2. Dairə şəklinə düşmək; dairəviləşmək. *Tabaq kimi girdələnmiş* (f.sif.) *on dörd gecəlik ayın ziyası dənizin üzərinə düşərək Xəzərin göy üzünü qırmızı misə döndərib quyruq kimi sahilə doğru uzun bir xətt uzatmışdı.* B.Talıblı. *Günəş girdələnib üfüqdə fırlanır..* M.İbrahimov.

**GİRDƏLƏŞDİRMƏ** "Girdələşdirmək"dən *f.is.*

**GİRDƏLƏŞDİRMƏK** bax **girdələtmək**.

**GİRDƏLƏŞMƏ** "Girdələşmək"dən *f.is.*

**GİRDƏLƏŞMƏK** *f.* 1. Girdə olmaq, yumrulaşmaq, yuvarlaqlaşmaq.

2. Dairə şəklinə düşmək, dairəvi olmaq.

**GİRDƏLƏTMƏ** "Girdələtmək"dən *f.is.*

**GİRDƏLƏTMƏK** 1. *f.* Girdə etmək; yumrulatmaq, yuvarlaqlatmaq. *Kündəni girdələtmək.*

2. *icb.* Dairə şəklinə saldırmaq, dairəvi etmək.

**GİRDƏLİK** *is.* 1. Yuvarlaqlıq, yumruluq, girdə şəklində olma.

2. Dairəvilik, dairəvi olma.

**GİRDƏNƏK** *sif.* Yumru, girdə.

**GİRDƏSİFƏT(Lİ)** *sif.* Sifəti girdə və kök olan. *Girdəsifət oğlan. Girdəsifətli qadın.*

– *İmran girdəsifət, alagöz, güləşqabaq, gözəl bir uşaq idi.* Mir Cəlal. *Sürücü qaragöz, qaraqaş, qırmızı, girdəsifət, sağlam bir cavan idi.* S.Vəliyev. *Tofiq isə, əksinə, alçaqboylu, sarışın, girdəsifət, ətli-canlı idi.* M.Rzaquluzadə.

**GİRDƏÜZ(LÜ)** bax **girdəsifət(li)**. *Mən girdəüz, şiş bığları yuxarı qaldırılmış bir gənc sifət axtarırdım.* S.Rəhman.

**GİRDİM-GİRDİM** bax **gildir-gildir**. *Gözlərinin yaşı girdim-girdim yanağından süzülən Mayanın əllərini Pərşan ovcunda sıxıb oxşayır..* M.İbrahimov.

**GİRDİN** *is. dan.* Mişarla bir boyda kəsilmiş odun. [Günay] *qapı ağzındakı üstü mişarlanmış girdin kimi çox hamar olan dəyirmi bir daş üstündə oturmuşdu.* Ə.Məmmədxanlı.

**GİRDİNLƏMƏ** "Girdinləmək"dən *f.is.*

**GİRDİNLƏMƏK** *f. dan.* Mişarla odunu bir boyda kəsmək.

**GİRDİRMƏK** *icb.* 1. Girməyə məcbur etmək, daxil etmək.

2. Taxmaq, keçirmək.

**GİRƏCƏK** *is.* 1. Qapı ağzı, kandar, astana. *Qazmanın girəcəyi. Girəcəkdə dayanmaq. – Sürətlə gedən maşın hündür bir evin girəcəyində durdu.* Q.İlkin.

2. Giriş; daxil olmaq, girmək üçün yer, yolun ağzı. *Səlim .. uçub girəcəyə tökülmüş torpaqdan yana .. yığmağa başladı.* Ə.Əbülhəsən.

3. Bir yerin başlanan hissəsi: başlanğıc, giriş. *Kəndin girəcəyi. Parkın girəcəyi. Bağın girəcəyində bir heykəl yüksəlir.* – [Mirzə İsmayıl:] *Gərək qonağa, necə ki lazımdır qulluq eləyəsiniz. Əvvəla, ağsaqqallar hamısı qabaqlarında kəndin mollası, gərək kəndin girəcəyində gedib dayansınlar..* Ə.Haqverdiyev.

4. Böyük otaqların qarşısında olan kiçik otaq, şüşəbənd və s. *Girəcəkdə oturmaq. – Bağır xurcunu aynabəndin girəcəyinə qoyub, üzünü Nazlıya tutdu..* İ.Məlikzadə. // Sif. mənasında. *İçəridə, yəni sol tərəfdəki girəcək otaqda üç adam var idi.* Ə.Vəliyev.

**GİRƏLƏMƏ** "Girələmək"dən *f. is.*

**GİRƏLƏMƏK** bax **girəvələmək**. [Ərəb Reyhan] *girələyib Eyvazın çiyin damarlarını saldı çəngəsinə.* "Koroğlu". [Əvvəlinci ovçu:] *..Doğrudan da Kərim* [Süleyman bəyi] *çox girələyirdi.* Ə.Haqverdiyev. [Səttar:] *Gəl naxır gələndə girələyək, vuraq* [mollanın] *atının qıçı sınsın.* P.Makulu.

**GİRƏM, GİRƏM Kİ** *ara s.* [*fars.*] *köhn.* Tutaq, tutaq ki, deyək ki. *Girəm ki, yaxşı elədilər yığmadılar, Allah atalarına rəhmət eləsin..* C.Məmmədquluzadə.

**GİRƏVƏ** *is.* 1. Gizli yer; pusqu, marıq, qurğu. *Girəvədə durmaq. – Əlavə olaraq ehtiyat üçün arxa girəvələrdə dəxi adamlar düzülmüşdü.* S.Rəhimov. ☐ **Girəvəyə salmaq** – tora salmaq, aldatmaq. *Ağaməcid .. hərifi girəvəyə salıb onun çiynindən bir təpik vurdu.* Mir Cəlal.

2. Əlverişli vəziyyət, fürsət, imkan. *Dovşan, tülkü, at, dəvə; Hərəsi söz deməyə; Axtarırdı girəvə.* R.Rza. ☐ **Girəvə düşmək** – fürsət düşmək, imkan yaranmaq. *Güldəstənin analığının bir xasiyyəti var idi: əri biriki günlüyə bir yana gedəndə, onun da əlinə girəvə düşüb sübhdən axşamadək evi Güldəstənin ümidinə qoyub, tamam kəndi evbəev gəzərdi.* Ə.Haqverdiyev. **Girəvə tapmaq** – bax **girəvələmək**. *Lakin* [Gülyaz] *özünü möhkəm saxladı və girəvə tapıb var gücü ilə canavarın qarnına vurdu.* Q.İlkin. [Kişi Vahidə:] *İndisə düşmən mənə də girəvə tapdı, qurğu qurdu.* B.Bayramov. **Girəvəni əldən buraxmaq (qaçırmaq)** – fürsəti əldən vermək, imkandan istifadə etməmək.

**GİRƏVƏLƏMƏ** "Girəvələmək"dən *f.is.*

**GİRƏVƏLƏMƏK** *f.* Fürsət tapmaq, imkan tapmaq, əlverişli vəziyyət axtarmaq. [Pəri xanım:] *Qadan alım, get girəvələ, zindanbana xəlvətcə pul ver, Qurbanini zindandan çıxart..* "Qurbani".

**GİRGİ** *is. dan.* Sancı, ağrı, qarınağrısı. ◊ **Qarnına girgi düşmək** – qorxuya düşmək, təşvişə düşmək. **Qarnına girgi salmaq** – bərk qorxuya salmaq, təşvişə salmaq. *Xalıqverdinin budəfəki gəlişi Orucla Fərruxun qarnına girgi saldı.* Ə.Vəliyev.

**GİRHAGİR** *is.* 1. Girmə, daxil olma.

2. **Girhagirdə** şəklində *zərf* – girəndə, girən zaman. *Kəndə girhagirdə qüvvətli bir zəlzələ olur.* "M.N.lətif."

**GİRİBAN** *is.* [*fars.*] *klas.* Yaxa. *Mən nə hacət ki, qılam daği-nihanım şərhin? Aqibət*

*zahir olur çaki-giribanımdan.* Füzuli. *Götür, tulla bir kənara çarqatı; Giribandan sinən ağı görünsün.* Q.Zakir.

**GİRİFTAR** *sif.* [*fars.*] Tutulmuş, düçar, mübtəla. [Pişik siçana dedi:] *Çəngəlimə indi giriftarsan; Ta ki edirsən belə rəftar sən.* S.Ə.Şirvani. □ **Giriftar etmək** – düçar etmək, məruz qoymaq, mübtəla etmək. *Gər səhhətə qadir olsa bimar; Dərdə özün eyləməz giriftar.* Füzuli. **Giriftar olmaq** – tutulmaq, düçar olmaq, məruz qalmaq, mübtəla olmaq. *Dərdə giriftar olmaq. – Hər halda, əvvəl binadan yazıq taybuynuz öküzün günü qara gəlib, allahın qəzəbinə giriftar olubdur.* F.Köçərli. *Amma iki ay bundan sonra biçarə dayım oğlu ruh azarına giriftar oldu.* C.Məmmədquluzadə. *Biçarə* [Zeynal] *cürbəcür əzablara giriftar olub, sifətində dəqiqədə min rəng müşahidə olunurdu.* Çəmənzəminli; // eyni mənada “eşqə” sözü ilə – aşiq olmaq, vurulmaq. *Eyləyibsən məni eşqə giriftar; Gündüzüm biqərar, gecələr bidar.* M.P.Vaqif. *Qəm evində zar olalı; Eşqə giriftar olalı; Yarımadıq yar olalı; Nə mən səndən, nə sən məndən.* Q.Zakir.

**GİRİFTARLIQ** *is.* Mübtəla olma, düçar olma, tutulma, mübtəlalıq.

**GİRİNC: girinc eləmək (etmək)** – təngə gətirmək, cana gətirmək, zəhləsini tökmək. *O, səhərdən bizi girinc eləyib.* – [Mədəd:] *Qəşəm məni girinc eləyib.* S.Rəhimov. **Girinc (olmaq)** – təngə gəlmək, cana gəlmək. *Evimdə müntəzirkən körpələrim, yoldaşım; Qorxunc ölüm əlində girinc qalmışdır başım.* M.S.Ordubadi.

**GİRİNTİ** *is.* Hamar olmayan səthdə iki çıxıntının arası; çuxur, çökək (*çıxıntı* əksi).

**GİRİNTİ-ÇIXINTI** *is.* Səthin düz olmaması, hündür və batıq olması.

**GİRİNTİLİ** *sif.* Səthi düz olmayan, girintiləri olan, kənarları hamar olmayan.

**GİRİNTİ(Lİ)-ÇIXINTILI** *sif.* Girintisi və çıxıntısı olan, səthi, yaxud kənarları düz olmayan, qalxıq və batıq olan. *Qabın girintili-çıxıntılı kənarı. – Silab qayanın girintili-çıxıntılı yerləri ilə aşağı enməyə başladı.* S.Vəliyev.

**GİRİŞ** *is.* 1. Giriləcək yer, daxil olmaq üçün yer, yol (*çıxış* əksi). *Giriş yolu.*

2. Bir əsərin başlanğıc hissəsi: müqəddimə, ön söz, ilk söz. *Kitabın girişi. Dissertasiyanın girişi. Giriş sözü.*

**GİRİŞİLMƏ** “Girişilmək”dən *f.is.*

**GİRİŞİLMƏK** *məch.* Başlanılmaq, şüru edilmək. *Səhranın sərt təbiəti ilə ciddi döyüşə girişilmişdi. – Dəmirovun təklifi üzrə bu yolun inşasına payız məhsulunu topladıqdan sonra girişilirdi.* S.Rəhimov.

**GİRİŞMƏ** “Girişmək”dən *f.is.*

**GİRİŞMƏK** *f.* 1. Həvəslə, ciddiyyətlə bir işə başlamaq, şüru etmək. *İşə girişmək. Yarışa girişmək.* – [Nəsir] *hələ bəzi vaxt öz fikrinin üstündə duraraq böyük qardaşı ilə mübahisəyə də girişirdi.* S.Hüseyn. *Məclis sakit idi, hamı yeməyə girişmişdi, ağız marçıltısından başqa bir şey eşidilmirdi.* Çəmənzəminli.

2. Cürət etmək, cəsarət göstərmək. *Başqa adam belə işə çətin girişərdi.* Qantəmir.

3. Üstünə hücum etmək, cummaq. *İkisi də qızmış nər kimi bir-birinə girişdilər.* “Koroğlu”. *Rüstəm kişi pencəyini çıxarıb kənara atdı, Lal Hüseynə girişdi.* M.İbrahimov.

**GİRİZ** *is.* [*fars.*] *klas.* Qaçma, qaçış. □ **Giriz vermək** – qaçmaq, aradan çıxmaq, sovuşmaq. *Molla Tanrıverdi bir söz deməzdi, ancaq fürsət tapıb Cümşüd bəyin əlindən giriz verib qaçardı, asta qaçan namərddir.* E.Sultanov.

◊ **Giriz vurmaq** – işarə vurmaq, eyham vurmaq. *Gözəl Həbibə giriz vururmuş kimi dedi..* Ə.Vəliyev.

**GİRLƏMƏ** “Girləmək”dən *f.is.*

**GİRLƏMƏK** *f.* Pusmaq, daim təqib etmək, dalınca gəzmək, əl çəkməmək. [Mindilli:] *Zərifə, nə .. girləmisən məni? Niyə mənim başıma fırlanırsan?* S.Rəhman.

◊ **Başını girləmək** – b a x **baş**. **Əcəl (ölüm) girləmək** (bəzən “başını” sözü ilə) – b a x **əcəl**.

**GİRLƏNDİRMƏ** “Girləndirmək”dən *f.is.*

**GİRLƏNDİRMƏK** b a x **girləmək**.

**GİRLƏNMƏ** “Girlənmək”dən *f.is.*

**GİRLƏNMƏK** *f.* 1. Gəzmək, dolaşmaq, dolanmaq. *Nəbi Naxçıvanda bir az girlənib, İsmayılın yerini öyrənməyə çalışırdı, ancaq tapmırdı.* “Qaçaq Nəbi”. *O, Şehli kəndinin arasında xeyli dolandı, girlənə-girlənə* (z.)

*Safonun kahasının qabağında dayandı.* S.Rəhimov.

2. Yaşamaq, dolanmaq, birtəhər baş saxlamaq, keçinmək. *Orada-burada girlənmək.* – [Çimnaz] *birtəhər girlənən ailəni artıq xərcə-borca düşməkdən qorumaq istəmişdi.* Ə.Əbülhəsən.

**GİRLİ** *sif.* 1. Güclü, qüvvətli, giri olan. *Girli qol. – Yəni o elə girli adamdır? – Bəli, bəli, – deyə* [Əsgər] *əlavə etdi.* Ə.Əbülhəsən.

2. *məc.* Çoxlu, çox.

**GİRMƏ¹** "Girmək"dən *f.is. Martın yenicə girməsinə baxmayaraq hava ılıq idi.*

**GİRMƏ²** *is. məh.* Kolluq, kol-kosluq. *Kəsdilər girməni Cəbilə Osman; Verməsin arxaya keçməyə aman.* H.K.Sanılı.

**GİRMƏK** *f.* 1. Daxil olmaq, içəriyə keçmək (*çıxmaq* əksi). *Evə girmək. Otağa girmək. Qapıdan girmək. – Mirbağır ağa girir, başmaqlarını çıxardır, salam verir.* C.Məmmədquluzadə. [Mərcan bəy:] *A gədə, qoçaq, mən səni çağırmayınca sən bu otağa girmə!* Ü.Hacıbəyov. *Bağa girmənəm sənsiz; Gülü dərmənəm sənsiz..* (Bayatı).

2. Sığmaq, yerləşmək. *Əlim əlcəyə girmir.*

3. Çatmaq, yetişmək, daxil olmaq. *Biz şəhərə girdiyimiz zaman şiddətli xəzri əsir, küçələrin tozunu havaya sovurur, göydən başımıza torpaq yağırdı.* A.Şaiq. *Tehrana girənə qədər Gülnaz da, Səriyyə də Musa kişini, Firidunu tapacaqları ümidi ilə yaşayırdı*(*lar*). M.İbrahimov.

4. Başlamaq, başlanmaq, gəlmək, daxil olmaq. *Qış girdi. Yaz girdi. – Cənubda mart girən zaman; Əsil gözəl bahar olur.* M.Dilbazi.

5. Bir yerdə gizlənmək, bir şeylə örtünmək. *Günəş buludun dalına girdi. – Açıqlıqdan keçdi, kömür qədər qara və müzlüm görünən qamışlığa girdi.* H.Nəzərli. *Süzülən nurunu toplayıb qəmər; Girdi buludlara, qaraldı göylər.* M.Rahim.

6. Yatmaq üçün yorğan-döşəyə uzanmaq. *Yorğan-döşəyə girmək. – Gəldim, soyundum, girdim yerə, amma sübhədək gözümə yuxu gəlmədi.* Ə.Haqverdiyev. *Ziba yatağına girincə yuxulamışdı.* S.Hüseyn.

7. Daxil olmaq (bir təşkilata, işə, məktəbə və s.-yə). *İşə girmək. Məktəbə girmək. İnstituta girmək.* – [Teymur] *yeddinci sinfi bitirib, sənət məktəbinə girmiş, oranı da müvəffəqiyyətlə qurtarmışdı.* M.Hüseyn. *Xalça fabrikində girib xidmətə; Bağlandı zəhmətə vicdanla Rəna.* M.Rahim.

8. Batmaq, keçmək. [Aslanın] *iki böyük dəmir parçası qarnına girmiş, bağırsaqlarını çölə tökmüşdü.* Ə.Vəliyev.

9. *məc.* Girişmək, başlamaq.

10. *məc.* Bir şeylə örtünmək. *..Saqqalı ağ olanın qiymətidir bir qara pul; Gərçi girsə bəzənib gündə yaşıl, al içinə.* M.P.Vaqif.

11. Yuyunmaq, çimmək üçün bir şeyin içinə, ya bir yerə daxil olmaq. *Suya girmək. Çaya girmək. – Hovuza girən qaşqabaqlı çıxmazdı, həmişə şad, nurani, pak-pakizə olardı.* Çəmənzəminli. [Həsənqulu bəy:] *Əşi, insafdır, o xəznəyə mən də girim, bu hambal da girsin?* Ü.Hacıbəyov.

12. Soxulmaq. *Adamların içinə girmək.*

13. Dolmaq (adətən "yaşa, yaşına" sözü ilə). *10 yaşa girmək.* – [Vəzir:] *Sən on dörd yaşına girdiyin zaman; Ərəb ölkəsinə göndərdi atan.* A.Şaiq. *Bir neçə ay bundan qabaq; Girmişdi o doqquz yaşa.* M.Dilbazi.

14. *məc. kob.* Pul, çəki və s. haqq-hesabında aldatmaq.

15. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: başına girmək, beyninə girmək, yuxusuna girmək, qoluna girmək.

**GİROV** *is.* [*fars.*] *köhn.* 1. Borc alınan pul və s. müqabilində təminat üçün verilən şey. [Məşədi Cabbar:] *Əgər mümkün olur isə; mənim üçün Hacı Rəhimdən min manat al, iki dükanım var, yanında girov olsun.* M.F.Axundzadə. [Xudayar bəy Kərbəlayı Cəfərə:] *..Sən bir elə adam tap ki, mənə yeddi manat versin, mən onun yanında on yeddi manatlıq şey girov qoyum..* C.Məmmədquluzadə.

2. Bir dövlət və ya təşkilatın öhdəsinə götürmüş olduğu iltizam və ya tələblərin yerinə yetirilməsini təmin etmək məqsədilə zorla tutulub saxlanılan adamı. [Qara Məlik] o *tərəf-bu tərəfdə Nüsrəddinin adamlarını tutub girov saxlamağa başladı.* M.S.Ordubadi. *Bayındır xan* [çapqınçıları] *girov saxlamış, qıpçaqların əlini-qolunu bağlamışdı.* M.Rzaquluzadə.

**GİROVDAR** *is.* [*fars.*] *köhn.* Girov saxlayan, girov alan, girovla pul verən adam.

**GİROVDARLIQ** *is. köhn.* Girovdarın işi, peşəsi.

**GİROVLU** *sif.* Girovla alınmış. *Girovlu borc.*

**GİROVSUZ** *zərf* Girov almadan, girov götürmədən, girov qoyulmadan. [Məşədi Cəfər:] *Ruzigar elə dönübdür ki, qardaş qardaşa etibar eləyib girovsuz bir qəpik borc verməyir.* Ə.Haqverdiyev. [Hacı Kərim] *ömründə girovsuz kimsəyə pul verməmişdi.* S.Hüseyn.

**GİRS** *məh.* b a x **gürzə**[2]. *Qurban qoyununun ətindən qız evi oğlan evinə lülə-kabab, girs və dolma göndərər.* R.Əfəndiyev.

**GİRSİZ** *sif. dan.* Giri olmayan; gücsüz, qüvvətsiz, zəif. *Girsiz adam. Girsiz əl. – Bu hikməti babam deyib: “Girsiz dostdan bir qara daş...”* M.Araz.

**GİRVƏ** *is.* Keçidlərdə, yollarda qar yığını.

**GİRVƏNKƏ** *is. köhn.* 400 qrama bərabər köhnə ağırlıq ölçüsü. *İki girvənkə yağ.* – [Əsgər bəy:] *Girvənkəsi bir manata alınan çay burada manat yarıma göydə gedir..* M.F.Axundzadə. *Uşaq on dörd yaşına çatan kimi, gündə ona iki girvənkə xurma verirdilər.* C.Məmmədquluzadə.

◊ **Girvənkə qıfıl** – şəkilcə çəki daşına oxşayan, açılarkən hissələri bir-birindən ayrılan asma qıfıl. *Əjdər qapının birinin üzərindəki asma girvənkə qıfılı açıb .. otağa girdi.* S.Rəhman.

**GİRVƏNKƏLİK** *sif. köhn.* 1. Çəkisi girvənkə ağırlığında olan. [Taxıl buraxan] *da hazırlaşdı, girvənkəlik daşı əlinə götürüb cavab verdi.* Ə.Vəliyev.

2. Çəkilən, ölçülən şeyin ağırlığını, həcminin, tutumunun neçə girvənkəyə bərabər olduğunu bildirir. – *..Xudayar bəy üz qoydu bazara, yeddi girvənkəlik qəndlərdən bir kəllə alıb vurdu geyməsinin altına.* C.Məmmədquluzadə. [Hacı Sultanın] *iki girvənkəlik bürünc bir daşı vardı.* S.Hüseyn.

3. *is.* Girvənkə ağırlığında daş. *Girvənkəliyi tərəziyə qoymaq.*

**GİRVƏNKƏ-TƏRƏZİ** *top.* Tərəzi və çəki daşları bir yerdə. *Arşın, girvənkə-tərəzi yenə möhkəm işə düşmüşdü.* S.Vurğun.

**GİRYAN** *sif.* və *zərf* [*fars.*] *klas.* Ağlayan, sızlayan, ağlağan, ağlar. *Qan yaşım qılmaz vəfa, giryan gözüm israfına; Bunca kim, hərdəm cigər qanından imdad eylərəm.* Füzuli. ◻ **Giryan etmək (eləmək)** – ağlatmaq, sızıldatmaq, gözü yaşlı etmək. *Bir günüm sənsiz əgər keçsə min əfğan edərəm; Səndən ötrü bütün övladımı giryan edərəm.* M.Ə.Sabir. **Giryan olmaq** (bəzən “gözü”, “didəsi” sözləri ilə) – ağlamaq, göz yaşı tökmək. *Olduqca əlində oldu xəndan; Düşdükcə əlindən oldu giryan.* Füzuli. *Dərdindən didəsi giryan olmuşam..* M.P.Vaqif. *Ey dərbədər gəzib ürəyi qan olan çocuq! Bir loğma nan üçün gözü giryan olan çocuq!* M.Ə.Sabir.

**GİRYƏ** *is.* [*fars.*] *klas.* Göz yaşı tökmə, ağlama, sızlama, inildəmə. *Gülməgində qanlı-qanlı giryələr; Hər müsəlman könlümü məhzun elər.* A.Səhhət. ◻ **Giryə etmək** – ağlamaq, sızlamaq, göz yaşı tökmək.

**GİŞ** *is.* Alçaq növlü kəndir və ya kətan lifindən toxunmuş cod parça. *5 metr giş.* // Həmin parçadan tikilmiş. *Giş kisə. Giş başlıq.* – [Səmədin] *bütün paltarı bir giş torbadan ibarət imiş.* T.Ş.Simurq.

**GİTARA** [*isp.*] Mizrabla çalınan, səkkizlik şəklində uzunqollu simli musiqi aləti. *Gitara çalmaq.*

**GİTARAÇALAN, GİTARAÇI** *is.* Gitarada çalan çalğıçı.

**GİYAH** *is.* [*fars.*] *köhn.* Ot, göy.

**GİYİD** *is.* Quşu aldadıb tutmaq üçün işlədilən quş səsi çıxaran alət. *..Quşçular bildirçin düdüyü* (*giyid*) *çalmaqla erkək bildirçini aldadıb tutardılar.* H.Sarabski.

**GİYİŞMƏ** “Giyişmək”dən *f.is.*

**GİYİŞMƏK** b a x **gicişmək**. [Vaqif:] *Ay Mirzə, deyərlər: keçinin buynuzu giyişəndə başını çobanın dəyənəyinə sürtər..* Çəmənzəminli.

**GİYOV** *is.* Kürəkən. [Soltan bəy:] *Əşi, xan ilə aş yemirəm ki, bığım yağa batar, bir gədənin birisi mənə giyov olmaq istəyir.* Ü.Hacıbəyov. [Zöhrə Fərmana:] *Mən istəyirəm, anam sənin ona giyov olduğunu bilsin.* Ə.Abasov.

**GİYOVLUQ** *is.* Kürəkənlik.

**GİZİLDƏMƏ** “Gizildəmək”dən *f.is.*

**GİZİLDƏMƏK** *f.* 1. Yorğunluqdan, ağrıdan, soyuqdan sancmaq, göynəmək. *O əyilib*

*şırranda əllərini yudu, barmaqları donub gizildəyincə qalxıb o tərəf-bu tərəfə boylandı.* S.Rəhimov. *Həsrət duracaqda ayağının birini götürüb o birini qoyur, soyuqdan gizildəyən burnunu, qulağını ovuşdura-ovuşdura .. düşünürdü.* B.Bayramov.

2. *məc.* Titrəmək, qorxu keçirmək, həyəcanlanmaq. *Qızın yumşaq və nazik əlləri ovcuna toxunanda Nərimanın qəlbində odlu bir sim gizildədi.* Mir Cəlal.

**GİZİLDƏTMƏ** "Gizildətmək"dən *f.is.*

**GİZİLDƏTMƏK** *f.* 1. Göynətmək, ağrıtmaq, sancmaq.

2. *məc.* Titrətmək, həyəcanlatmaq.

**GİZİLTİ** *is.* Yorğunluqdan, ağrıdan, soyuqdan bədənin bir yerində duyulan ağrı, sızıltı, göynəmə, sancı. *Bədənində gizilti duymaq. – Talıb xan yüzbaşının bütün vücudunda bir odlu gizilti gəzdi.* S.Rəhimov. *Tahir .. gözədəyən bir iş görmədiyini fikirləşəndə ürəyinin giziltisi daha da artdı.* M.Hüseyn. *Bir gizilti duydu o, zəif düşmüş canında...* B.Vahabzadə.

**GİZİLTİLİ** *sif.* Ağrılı, sızıltılı, sancılı.

**GİZİR**[1] *is. köhn.* 1. Aşağı rütbəli inzibati işçi. [Giziroğlu Mustafa bəyin] *atası keçmişdə gizir olmuşdu.* "Koroğlu". *Vəkildən sonra qlavanın giziri Cəlil bəy çıxdı, bu da çəkil-çəkil deyib, tatarını oyza tovladı, buyza tovladı, özü də çəkilib durdu bir səmtdə.* C.Məmmədquluzadə.

2. Köməkçi, əlaltı. *Koxanın şahidi gizir olar.* (Məsəl).

**GİZİR**[2] *is.* Aşıq-aşıq oyununda aşığın toxan tərəfinə əks olan tərəfə verilən ad. *Aşıq toxan durdu, ya gizir?*

**GİZLƏDİLMƏ** "Gizlədilmək"dən *f.is.*

**GİZLƏDİLMƏK** *məch.* 1. Gizli yerə qoyulmaq, gizli yerdə saxlanılmaq, yeri bildirilməmək, qapadılmaq. *Şeylər gizlədilmişdir.*

2. Gizli saxlanılmaq, açılmamaq, deyilməmək (fikir, niyyət).

**GİZLƏDİLMİŞ** *f. sif.* Gizli yerə qoyulmuş, gizli yerdə saxlanılan. *Gizlədilmiş şeylər.*

**GİZLƏMƏ** "Gizləmək"dən *f.is.*

**GİZLƏMƏK** b a x **gizlətmək**. *Oxunu atıb, yayını gizləmə!* (Ata. sözü). *..Anası, Səlminazı o biri evə salıb Əmrahdan gizlədi.* "Əmrah". *Eyibsiz gözəlin xoş olur xoyu; Gizləməz camalı, qaməti, boyu.* M.P.Vaqif. [Musanın nəvəsi] *sarı portfelini gizlədi, əlinə böyük və qara bir portfel aldı.* Qantəmir.

**GİZLƏNC** *is.* Gizlədilmiş, gizli saxlanılmış hər hansı bir şey.

**GİZLƏNQAÇ** b a x **gizlənpaç**.

**GİZLƏNMƏ** "Gizlənmək"dən *f.is.*

**GİZLƏNMƏK** *f.* Başqalarının görə və tapa bilməməsi üçün örtülü bir yerə girib qapanmaq. *Pərdənin dalında gizlənmək. – Bəlli Əhməd bir fikirləşdi ki, piştaxtanın dalına girib gizlənsin.* "Koroğlu". *Özüm də .. kürkü tərsinə geyib bir damın içində gizlənmişdim.* Ə.Haqverdiyev. // Məc. mənada. *Ayrılıb arzumun keşməkeşindən; Gizlənmə könlümdə sən də, ey ilham?* M.Müşfiq. *Sözün ruhunda gizlənmiş bütün dahilərin eşqi.* S.Vurğun.

**GİZLƏNPAÇ** *is.* Bir iştirakçının müxtəlif yerlərdə gizlənmiş qalan iştirakçıları axtarıb tapmasından ibarət uşaq oyunu. *Gah gizlənpaç oynayır; Gah qaçhaqaç oynayır.* R.Rza. *Meşə içindəki talada hər gün; Gizlənpaç oynardım yoldaşlarımla.* B.Vahabzadə. [Çiyələk Gülöyşəyə:] *Oğlumgil hələ gizlənpaç oynayırlar.* B.Bayramov.

◊ **Gizlənpaç oynamaq** *məc.* – açıq-açığına deyil, əsil fikrini gizlədərək hərəkət etmək. *Qumru bu ağır fəlakət vaxtında* [Qədirlə] *gizlənpaç oynayırmış kimi gah görünür, gah batırdı.* Mir Cəlal. *Sirlərlə doludur bu böyük aləm; Gizlənpaç oynayır sənlə elə bil.* H.Arif. **Gizlənpaç oyunu** *məc.* – hiylə, fənd, fırıldaq. [Nərminə:] *Gizlənpaç oyunu nəyə lazımdır?* B.Bayramov.

**GİZLƏTMƏ** "Gizlətmək"dən *f.is.*

**GİZLƏTMƏK** *f.* 1. Başqasının görməməsi, tapmaması üçün gizlin yerdə saxlamaq, gizlin, gözdən uzaq yerə qoymaq. *Kəndlilər .. qorxularından uşaqları gərmə qalaqlarının içində gizlədib uçitelə deyiblər ki, bizim kənddə heç qədimdən uşaq olmaz.* C.Məmmədquluzadə. [Səfər Gülnaza:] *Telli məndən gizlədən kimi, sən də pulu atandan gizlədirsənmi?* Çəmənzəminli.

2. Bildirməmək, hiss etdirməmək, sezdirməmək. *Fikrini* (*niyyətini*) *gizlətmək. Qorxusunu gizlətmək. – Ələmdar titrəməsini gizlətməyə çalışaraq, dönüb buradan getmək istədi.* S.Rəhimov. [Zəhra] *ancaq halındakı*

*dəyişikliyi də gizlədə bilmirdi.* M.İbrahimov. // Bilə-bilə bir şeyi xəbər verməmək, üstünü örtmək. *Heç bir şeyi gizlətmədən söylədi.*

3. Bir şeyin üstünü örtmək, qapamaq. *Bahadır yanı üstə çevrildi. Başını yorğanın altında gizlətdi.* M.Hüseyn. *Sifətini qulaqlı papaq altında gizlətmiş* (f.is.) *dəmiryolçu qarşımdan ötürdü.* Mir Cəlal.

**GİZLİ** 1. *sif.* Başqası, ya başqaları üçün sirr olan, onlardan gizlədilən, çoxlarına bəlli olmayan, bilinməz olan, məlum olmayan. *Gizli müqavilə.* // Məxfi. *Gizli məktub. Gizli sənəd.* □ **Gizli qalmaq** – heç kəsə məlum olmamaq bildirilməmək. *Qalmasın sözlərin qəlbində gizli; Mən görmək istəməm çöhrəni sisli.* M.Müşfiq. **Gizli saxlamaq** – heç kəsə məlum etməmək, başqalarına bildirməmək. *Deməli, aldılar əlimdən səni; Nakam məhəbbəti gizli saxladı.* M.Rahim. // Özünü büruzə verməyən, gizlin hərəkət edən, hələ üzə çıxarılmamış. *Gizli qüvvə. – Gizli düşmən ilan kimidi, sürünə-sürünə gələr*. (Ata. sözü). // Başqalarına məlum olmayan, ürəkdə saxlanan. *Gizli fikir. Gizli hiss. – Səndən sənə gizli şikayətim var; Ey mələk ədalı, xuraman gəlin!* H.Cavid. *Bunun hərəsində bir məlahət, hərəsində gizli bir ləzzət var.* Çəmənzəminli. // Başqaları bilməli olmayan, biri üçün sirr olan. *Bağışla, sevgilim, açıq söylədim; Gizli nöqtələrə əl aparma sən.* S.Vurğun. // Məhrəmanə, intim. *Gizli əlaqə. Gizli görüş.* – [Fəzl:] *Amandır, ey qardaşım, xəlifə bu gizli görüşlərdən xəbər tutsa, beşikdəki körpələrimizə belə rəhm etməyəcək!* Ə.Məmmədxanlı. // Naməlum, heç kəsin bilmədiyi və ya az adamın bildiyi. *Gizli yol. Gizli cığır. – Səlim məharətlə, gizli yollar ilə düşmənin qərargahına qədər girir, ciddi hərbi əhəmiyyəti olan sənədlərdən əldə edib gətirirdi.* S.Rəhimov.

2. B a x **qeyri-leqal**. *Gizli qəzet. Gizli dərnək. Gizli fəaliyyət.*

3. Açıq fəaliyyət göstərməyən; məxfi. *Gizli polis. Gizli xəfiyyə idarəsi.*

4. *zərf* Xəlvəti, gizli olaraq, gizlində, başqalarının xəbəri olmadan. *Gizli gəlmək. Gizli qaçmaq. Gizli xəbər vermək.*

◊ **Gizli seçkilər** – gizli səsvermə yolu ilə keçirilən seçkilər. **Gizli səsvermə** – bülletenləri və ya keçmişdə şarları qutuya salmaq yolu ilə səsvermə üsulu.

**gizli-gizli** *zərf* b a x **gizli** 4-cü mənada. *Gizli-gizli iş görmək. – Yenə də bir vuraydı qəlbimiz gizli-gizli; Sən ey əsmər bənizli!* M.Müşfiq. [Uşaq] *oturdu qapının küncündə, başladı gizli-gizli ağlamağa.* Çəmənzəminli.

**GİZLİCƏ** *zərf* 1. Heç kəs görmədən, gözə görünmədən; xəlvəti. *Gizlicə görüşmək. Gizlicə danışmaq. – Deyirlər tüstüsüz bir şair yanar; Qəlbi öz dərdini ağlar gizlicə; Bəzən gözlərində gəlib dayanar; Sevdiyi çəmənlər, dağlar gizlicə.* M.Araz.

2. Heç kəs bilmədən, heç kəsin xəbəri olmadan; məxfi. *Uzaqdan bir kölgə* [Səlim və Mehribanı] *pusur, gizlicə təqib edirdi.* S.Hüseyn. *Bayandır xan ..* [quldurların] *üstünə gizlicə göz qoydurmuşdu.* M.Rzaquluzadə. *Mənə gizlicə baxır; Qəzəblə dolu gözlər.* B.Vahabzadə.

**GİZLİQOVUŞANLAR** *cəm biol.* Sporlar vasitəsilə cinsi törəyib artan bitkilər (məs.: göbələk, yosun və s).

**GİZLİLİK** *is.* Gizli olma; naməlumluq, məxfilik.

**GİZLİN** b a x **gizli** 1 və 4-cü mənalarda. [Nabat:] *Mən də sənin kimi gizlin, gündə ocaqda yumurta bişirib yeyərəm?* S.S.Axundov. [Yetər:] *Məşədi Fatma, Allahdan gizlin deyil, daha səndən niyə gizlin olsun, sənin qızın bizə çox xoş gəlib.* Çəmənzəminli.

**gizlin-gizlin** b a x **gizli-gizli**. *Gizlin-gizlin sənlə etdim ilqar; İndi bildim səndə yoxmuş etibar...* Aşıq Abbas. [Rövşən:] *Yenə gizlin-gizlin işlər görürsən?* S.Rəhman.

**GİZLİNC, GİZLİNCƏ** b a x **gizlicə**. *Sonra* [qızı] *toysuz, gizlincə dəliyə gəlin aparırlar.* S.S.Axundov. *O səs yenə gizlincə; Dedi*: *– Ay qəlbi incə!* M.Dilbazi. *Sultan darıxmış halda gizlincə köksünü ötürdü.* İ.Hüseynov.

**GOD** *is. məh.* Çəllək, boçka. [Həsən] *..həyətdə köhnə god və paslı tənəkələr arası ilə keçib, üfunətli pilləkənə yanaşdı.* Çəmənzəminli.

**GODUL** *is.* 1. Ağacdan, taxtadan qayrılmış kukla, gəlincik.

2. *məc.* Kök və kiçikboylu adam haqqında.

**GOMUŞ** b a x **camış**. [Cənnətəli ağa:] *Deməzsənmi Kərbəlayının on dörd gomuşu, altı inəyi bu qış tələf olubdu.* N.Vəzirov.

**GONBUL** *is.* və *sif.* Kök, koppuş, ətli, tosqun. *Gedirdi gonbul; Əlində dumbul...* (Uşaq mahnısı).

**GONBULLUQ** *is.* Köklük, ətlilik, tosqunluq. *Gonbulluğundan yeriyə bilmir.*

**GOP** *is. dan.* 1. Mübaliğəli danışıq; şişirdilmiş, uydurma söhbətlər. [Qadir kişinin] *bu cür gopları çox vaxt yerinə düşərdi.* Ə.Sadıq. *Əhməd oğurluğun şərtlərindən xeyli danışdı. Daha onun gopunu eşitmək istəməyən Fərman Əhmədin qolundan tutub çəkdi.* Ə.Abasov. □ **Gop vurmaq** – bax **gopa basmaq**. [Bahar:] *Qoyasan elə axşamadək özündən gop vurub danışa.* Ə.Haqverdiyev. **Gopa basmaq** – bir şeyi, hadisəni çox şişirdərək danışmaq, mübaliğə ilə danışmaq. [Səttar:] *Gədə, – dedi, – çox gopa basıb uşaqları qorxuzma!* P.Makulu.

2. Yalan, uydurma, mübaliğə, şişirdilmiş şey.

**GOPALAMA** "Gopalamaq"dan *f.is.*

**GOPALAMAQ** bax **gopamaq** 1-ci mənada.

**GOPAMA** "Gopamaq"dan *f.is.*

**GOPAMAQ** *f. dan.* 1. Döymək, vurmaq, çəkmək, ilişdirmək. [Məmmədəli:] *Bacıoğlu! ..O qədər goparam cəmdəyinə, şişib dama dönərsən.* N.Vəzirov.

2. Bax **goplamaq**. [Əhməd:] *Gopa başına dönüm, gopa!* N.Vəzirov.

**GOPCUL** *dan.* bax **gopçu**.

**GOPÇULLUQ** *dan.* bax **gopçuluq**.

**GOPÇU** *sif.* Bir şeyi həddən artıq şişirdərək danışmağa, özü, öz işləri haqqında mübaliğə ilə danışmağa adət etmiş adam. *Şamdan bəy yalançı, gopçu, nankor, xain, fırıldaqçı bir adamdır.* M.Arif. // Yalançı, uydurmaçı. [Əmiraslan ağa:] *Yoxsa gopçu Ədilin sözündən xofa düşmüsünüz?* S.S.Axundov.

**GOPÇULUQ** *is. dan.* Mübaliğə ilə danışmaq xasiyyəti, bir şeyi şişirtmə, mübaliğə etmə. [Xankişi:] *Gopçuluq yaraşmır heç igidlərə.* Z.Xəlil. // Yalançılıq, uydurmaçılıq. [Kələntər] *təsadüfən yalançılıq, gopçuluq və hay-küylə bu vəzifəyə yüksələ bilmişdi.* M.İbrahimov.

**GOPLAMA** "Goplamaq"dan *f.is.*

**GOPLAMAQ** *f. dan.* 1. Mübaliğə ilə danışmaq, şişirdərək, artıraraq söyləmək. [Səlbnaz xanım:] *Mən gedirəm, bilirəm də oğluna iki yüz min pis şeylər mənim haqqımda məndən goplayacaqsan.* N.Vəzirov.

2. Yalan danışmaq, uydurmaq.

**GOPPULDAMA** "Goppuldamaq"dan *f.is.*

**GOPPULDAMAQ** *f.* Goppultu ilə düşmək, goppultu səsi çıxartmaq.

**GOPPULDATMA** "Goppuldatmaq"dan *f.is.*

**GOPPULDATMAQ** *f.* Goppultu ilə salmaq, goppultu səsi çıxarmaq.

**GOR** *is.* [*fars.*] Qəbir, məzar. *Atanın goru haqqı* (and kimi işlədilir). – *Qırxında öyrənən gorunda çalar.* (Ata. sözü). [Hümmətəli:] *Yox, verə bilmərəm, atamın goruna and içmişəm ki, heç kəsə nisyə verməyəm.* Ü.Hacıbəyov. *Hazırlan qətlə, edamə! Əcəb gorun, məzarın var!* Ə.Nəzmi. □ **Gora getmək** – ölmək, basdırılmaq.

◊ **Gor qonşusu** *məc.* – çox yaxın qonşular haqqında. [Piti Namaz:] *Mənnən nahaq qaçırsan, Bağır dayı. Gor qonşuyusuq, bir-birimizə lazımıq biz.* İ.Məlikzadə. **Gora (goruna) aparmaq** – qoruyub saxlamaq, işlətməmək, sərf etməmək (adətən istehza kimi işlənir). *Bir sandıq yığmışam, xərcləməyə yer tapmıram. Saxlayıb özümnən gora aparmayacağam ki!* M.Hüseyn. **Gora başıaşağı getmək** – ölərkən özündən yaxşı xatirə qoymamaq, xəcalətli getmək. *İndi ömrümün son çağında gora başıaşağı gedirəm.* S.Rəhimov. **Gora kəfənsiz gedəsən! (getsin!)** – qarğış ifadəsi. *Meynələrdə qora; İlişdim, düşdüm tora; Səni mənnən eləyən; Kəfənsiz getsin gora.* (Bayatı). **Goruna od qalansın!** – qəbri(n) yansın! (qarğış ifadəsi). *Goruna od qalansın; A bu sarsaq kişini əkən dədə!* "M.N.lətif." **Baş gora aparmaq** – ölmək, ölüb getmək. *Bədbəxt, mən o kəsə deyərəm ki, bu beş qara günü ləzzət-damaq ilə keçirib baş gora aparmaya.* Ə.Haqverdiyev.

**GORBAGOR** *is.* [*fars.*] Ölmüş adam haqqında söyüş məqamında işlənir. [Fəxrəddin:] *Onun* [Qətibənin] *gorbagor atasının qızın səadətini əlindən aldığı bəs olmadımı?* M.S.Ordubadi. [Ələmdar:] [Məşədi] *qır-saqqız oğlu qır-saqqız, elə bil o gorbagor Hacı Abtalıbın özüdür ki, qəbirdən xortduyub..* S.Rəhimov.

◊ **Gorbagor etmək** – ölmüş bir adamı rüsvay etmək, təhqir etmək, dalınca söymək. *Birisi Hacı Manafdır, özü Üryan oğlu; Gör mən indi edərəm gorbagor ol üryanı.* S.Ə.Şirvani. **Gorbagor olmaq** – ölmək, gəbərmək (söyüş kimi işlənir). [Səfər:] *Bilirəm, dədə-babam gorbagor olacaq! Cəhənnəmə, ondan mənə bir zərər yoxdur.* C.Cabbarlı.

**GORDA** *is.* Birağızlı, əyri qılınc; yatağan. *Gorda ilə vurmaq. – Qorodovoy börkünü başına basıb, gordası qılçasına dolaşa-dolaşa yüyürüb getdi...* Çəmənzəminli. *Nizə və gorda davasında* [Qəhrəmanın] *başına və üzünə bir neçə zərbə dəydi.* Ə.Vəliyev. *Pristav .. dəstəsi qotazlı gordasını pilləkənə toxundurmasın deyə, əlinə götürmüşdür.* Ə.Abasov.

**GOREŞƏN** *dan.* 1. B a x **kaftar** 1-ci mənada. [Zeynəb:] *Kazım, sənsən? Gecə vaxtı goreşən kimi qəbristanlıqda nə gəzirsən, baş-gözünü niyə sarıyıbsan?* İ.Şıxlı.

2. *məc.* Altdan-altdan iş görən; ziyankar (adətən söyüş məqamında). [Səkinə Rüstəmə:] *Yuxuma qara-qura gətirən goreşən, saman altdan su yeridən Yastı Salmandır..* M.İbrahimov. *Bu goreşən oğlu goreşən olmasaydı, indiki vaxtda bircə bu kənkan olmasaydı, – deyə, Gəray bəy kədərlə düşünürdü.* S.Rəhimov.

**GORGAH** [*fars.*] Qəbiristanda bir nəsildən olan adamların basdırıldığı yer; qəbir. [Budaq:] *Bircə aydan sonra bu qəbir itib-batar, atamın gorgahı bilinməz, nişangahından xəbərimiz olmazdı.* Ə.Vəliyev. [Sərvnaz:] *Camaat hər şeydən keçər, amma qohum-əqrəbasının .. gorgahının dağılmasına razı olmaz.* B.Bayramov.

**GÖBƏK** *is.* 1. Göbəkbağı düşdükdən sonra qarnın ortasında qalan kiçik çuxur, batıq. ☐ **Göbəyə qədər (kimi)** – belə qədər, beləcən. *Biçinçilər sıra ilə durmuş, göbəyə qədər qalxmış yaş otu biçir .. və qurumuş otlardan qotman vururdular.* A.Şaiq. *Su göldə göbəyimizə kimi çıxırdı.* S.S.Axundov.

2. B a x **göbəkbağı**. *Uşağın göbəyi düşdü.*

3. *məc. zar.* Bir şeyin mərkəzi, tən ortası, əsası mənasında. *Dünyanın göbəyi. – Bu zalım oğlu zalım axırda işi o yerə gətirib çatdırdı ki, İstanbulun göbəyindən xotkarın öz qızını da götürüb apardı.* "Koroğlu".

4. *məc.* Səbəbkar, bais mənasında. [Süleyman:] *Bütün bu işlərin göbəyi Tofiqdi.* M.İbrahimov.

5. B a x **göbəkduası**. [Ələsgər Mirzə Heydərə:] *Çıxıb getsənə göbək yazmağın dalınca!* Ə.Haqverdiyev.

◊ **Göbək bağlamaq** *zar.* – kökəlmək, ətlənmək, ətə-cana dolmaq. *Yağ salıb, bağlayıb cümlə göbək.* S.Ə.Şirvani. **Göbəyi düşmək** – ağır iş nəticəsində qarnı zədələnmək. **Göbəyini piyləndirmək** – b a x **göbək bağlamaq**. [Paşa bəy:] *Mən sənə ümidəm, sən də göbəyini piyləndirməkdən başqa heç nəyə fikir vermirsən.* Ə.Vəliyev.

**GÖBƏKBAĞI** *is. anat.* İnsan və ya heyvan rüşeymini ananın bədəni ilə birləşdirən və rüşeymin qidalanmasına vasitə olan boru.

**GÖBƏKCİK** *is.* Balaca, kiçik göbək. *Rüşeymlə ananın əlaqəsi göbəkcik vasitəsilə yaradılır.* "Qaramal".

**GÖBƏKDUASI** *is.* Köhnə məişətdə: cəhalət və nadanlıq əlaməti olaraq xəstə, yaxud uşağı olmayan qadınların göbəkləri ətrafına yazılan dua.

**GÖBƏKGÖTÜRƏN** *is.* Köhnə məişətdə: göbəkgötürmə ilə məşğul olan ara həkimi.

**GÖBƏKGÖTÜRMƏ** *is.* Köhnə məişətdə: ara həkimlərinin dua oxuyub göbəyə püfləməsindən ibarət yalançı müalicə üsulu.

**GÖBƏKKƏSMƏ** *is. etnoqr.* Qız və oğlan uşağını anadan olanda bir-birinə nişanlama adəti: beşikkəsmə. *Salondan daha bir qız səsi eşidildi: – Deyirlər, keçmişdə göbəkkəsmə olardı..* Ə.Sadıq.

**GÖBƏKLİ** *sif. dan.* Qarnı iri olan; kök, yoğun, yekəqarın. *Göbəkli adam. – Atlı dəstəsinin önündə gələn yaşıl çalmalı, şişman göbəkli adam Həmədan valisi idi..* Ə.Məmmədxanlı.

**GÖBƏKYAZAN** *is. köhn.* Göbəkduası yazan adam, molla (b a x **göbəkduası**). *Deyin o göbəkyazana, qələmin ucun yavaş bas!* M.Möcüz.

**GÖBƏLƏK** *is.* 1. *bot.* Xlorofili olmayan, əsasən sporlar vasitəsilə çoxalan ibtidai bitki. *Yeməli göbələk. Zəhərli göbələklər. – Uşaqları tapıb, çiyələk, göbələk toplamağa, ya dərədə daşlar arasında balıq tutmağa gedirdik.* A.Şaiq. [Sona:] *Bilirsən, Eyvaz, biz*

*göbələk yığmağa getmişdik, bir göbələk tapmışıq...* C.Cabbarlı.

2. Bir sıra dəri xəstəliklərinin əmələ gəlməsinə səbəb olan bitki mikroorqanizmləri. *Göbələk xəstəlikləri.*

◊ **Göbələk kimi yerdən çıxmaq (göyərmək)** – tez və bollu meydana gəlmək, törəmək.

**GÖBƏLƏKBAŞ** *sif.* Başının forması göbələk kimi olan; yastıbaş. *Göbələkbaş adam.* // *is.* Ağ əmmaməli din xadimlərinə istehza ilə verilən ad. [Fatma:] *Özüm də şəri məsələləri min sənin kimi göbələkbaşdan artıq bilirəm.* P.Makulu.

**GÖBƏLƏKCİK** *is.* Kiçik, xırda göbələk.

**GÖBƏLƏKLİK** *is.* Çoxlu göbələk bitən yer.

**GÖBƏLƏKŞƏKİLLİ** b a x **göbələkvari**.

**GÖBƏLƏKŞƏKİLLİLİK** b a x **göbələkvarilik**.

**GÖBƏLƏKVARİ** *sif.* Göbələk şəklində olan, şəkilcə göbələyə oxşayan; göbələkşəkilli. *Göbələkvari tağ.*

**GÖBƏLƏKVARİLİK** *is.* Göbələyə oxşayan şeyin şəkil və vəziyyəti; göbələk şəkillilik.

**GÖDƏCİK** *sif.* Boyca çox balaca; qısaboylu, kiçikboylu. *Sizi maraqlandıran məhrum sahibi haman bu gödəcik, axsaq, yaraşıqsız adamdır.* Mir Cəlal. // Gödək, qısa, gödərək. [Nailənin] ə*ynində gödəcik bir çit don vardı.* İ.Hüseynov.

**GÖDƏCİKLİK** *is.* Gödəcik şey və ya adamın halı.

**GÖDƏK** b a x **qısa**. *Gödək oğlan. Gödək saç. Gödək vaxt. Gödək yol. Gödək* (z.) *danışmaq.* İs. mənasında. *Gödək atıldı vurdu uzunun başına; Uzun dedi: "Əcəb yadıma saldın".* (Məsəl).

**GÖDƏKAYAQ(LI)** *sif.* Ayağı gödək olan; qısaayaqlı. *Gödəkayaq miz.*

**GÖDƏKBARMAQLI** *sif.* Barmağı, ya barmaqları gödək olan.

**GÖDƏKBOĞAZ(LI)** *sif.* Boğazı, quncu gödək olan; qısa boğaz(lı). *Gödəkboğaz çəkmə.*

**GÖDƏKBOY(LU)** *sif.* Boyu hündür olmayan, boyu qısa olan; alçaqboy(lu). *..Novruz 30 yaşında, gödəkboy, canlı oğlan idi.* N.Nərimanov. ..[Rəhim bəy] g*ödəkboylu, altmış sinnini ötmüş bir kişi idi.* Ə.Haqverdiyev. *Gödəkboy, tökmədaban, kürən Daşdəmirin yanaqları yaylaq havasından qıpqırmızı idi.* B.Bayramov.

**GÖDƏKBOYUN(LU)** *sif.* Boynu gödək olan; qısaboyun(lu). *Gödəkboyunlu adam.*

**GÖDƏKCƏ** 1. *zərf* Qısaca, uzun olmayan, müxtəsər. *Gödəkcə danışmaq.* // Sif. mənasında. *Gödəkcə ip.*

2. *is.* Bədənə kip yapışan qısa isti üst geyimi. *Pambıqlı gödəkcə. Meşin gödəkcə.* – *..Gödəkcəsini çiyninə salmış Dadaş Lələşov .. istehza ilə güldü.* S.Rəhimov. *Xəlil əllərini ciblərindən çıxarıb gödəkcəsinin boynunu qaldırdı.* İ.Məlikzadə.

**GÖDƏKCƏLİ** *sif.* Gödəkcə geymiş, əynində gödəkcə olan. *..Gödəkcəli, arıq bir oğlan direktor otağına girdi.* Mir Cəlal.

**GÖDƏKCƏLİK** *sif.* Gödəkcə tikməyə yararlı, gödəkcə tikmək üçün. *Gödəkcəlik parça.* // İs. mənasında. *Allah eləyəydi, mənə gödəkcəlik, şalvarlıq da almış olaydı!* M.Hüseyn.

**GÖDƏKDƏSTƏ(Lİ)** b a x **gödəksap(lı)**. *Gödəkdəstəli balta.*

**GÖDƏKQIÇ(LI)** *sif.* Qıçları gödək olan; qısaqıçlı. *Gödəkqıçlı kişi.*

**GÖDƏKQOL(LU)** *sif.* Qolu gödək olan; qısaqol(lu). *Gödəkqollu jaket.* – [Qızlar] *kombinezon geymiş, saçlarını yığıb yaylıqla bağlamış, dirsəkdən yuxarı gödəkqollu köynəklərdə həvəslə işləyirdilər.* M.İbrahimov.

**GÖDƏKQUYRUQ(LU)** *sif.* Quyruğu gödək olan; qısaquyruq(lu). *Gödəkquyruq it.* – *Gödəkquyruq dayçaların kişnəməsi eşidilirdi.* B.Bayramov.

**GÖDƏKLİK** *is.* Gödək şeyin halı; qısalıq (*uzunluq* ziddi). *..A kişi! O nədi hər nömrədə götürüb bəzi müsəlman şəhərlərinin arvadlarının tumanının gödəkligin gah yazırsan, gah da şəklin çəkirsən?* C.Məmmədquluzadə.

**GÖDƏKSAÇ(LI)** *sif.* Saçları gödək olan, saçları qısa kəsilmiş; qısasaç(lı). *Gödəksaç qız.*

**GÖDƏKSAP(LI)** *sif.* Sapı gödək olan; qısadəstə(li). *Gödəksap bel.*

**GÖDƏKYUN(LU)** *sif.* Yunu gödək olan; qısayun(lu). *Gödəkyunlu qoyun.*

**GÖDƏLDİLMƏ** "Gödəldilmək"dən *f.is.*

**GÖDƏLDİLMƏK** *məch.* Gödək kəsilmək, kəsilib gödək edilmək; qısaldılmaq.

**GÖDƏLMƏ** "Gödəlmək"dən *f.is.*

**GÖDƏLMƏK** *f.* 1. Gödək olmaq, qısalmaq. *Paltarı yuduqca gödəldi.* – [Rza:] *Divarların kölgəsi gödələrək öz dibinə düşdüyü günorta zamanları günəş adamı ilan kimi çalırdı.* M.İbrahimov. *Ağacların uzanan kölgələri getdikcə gödəlirdi.* Ə.Vəliyev.

2. Müddətcə azalmaq, məhdudlaşmaq, qısalmaq. *Gecələr gödəlir. – Gödəlir iştə gün, hava soyuyur; Payız olmuş, soyuq külək çovuyur.* A.Səhhət. *Ağır bir yuxuyla keçir min səhər; Ürək dil açır ki, gödəlir ömür!* S.Vurğun.

**GÖDƏLTDİRMƏ** "Gödəltdirmək"dən *f.is.*

**GÖDƏLTDİRMƏK** *icb.* Gödək hala saldırmaq; qısaltdırmaq.

**GÖDƏLTMƏ** "Gödəltmək"dən *f.is.*

**GÖDƏLTMƏK** *f.* 1. Gödək etmək, qısa etmək, qısaltmaq. *Paltonu gödəltmək.*

2. Müddətcə azaltmaq, məhdudlaşdırmaq, qısaltmaq. *Dedin ki, hurilər çatmaz köməyə; Meyvəsiz xəyallar ömür gödəldir!* S.Vurğun. *Müşkünazın anası qardaşının dərdini çəkəçəkə ömrünü gödəltdi.* Ə.Vəliyev.

**GÖDƏN** *is. dan.* Qarın. *Çaqqal var ki, gödən çıxarır, qurdun adı bədnamdır.* (Ata. sözü).

**GÖDƏNQULU** b a x **qarınqulu**.

**GÖDƏNQULULUQ** b a x **qarınqululuq**.

**GÖDƏRƏK** *sif.* 1. Bir qədər gödək; gödəcik, qısacıq. [Gələn işçilərdən] *biri .. gödərək, yapışıqlı, qara bir kişi idi.* Ə.Əbülhəsən.

**GÖL** *is.* 1. Dənizlə bilavasitə əlaqəsi olmayan təbii su hövzəsi. *Aral gölü. Göy göl. Şor göl. – Bir göl içrə üzürdü bir yekə qaz; Özünə fəxr edib uzatdı boğaz.* S.Ə.Şirvani. *Quşlar uçur göylərdə; Ördək üzür göllərdə.* A.Səhhət. // Süni surətdə düzəldilmiş böyük su anbarı; dəryaça. *Mingəçevir gölü.* // b a x **gölməçə**. *Küçədə göllər əmələ gəlmişdi. – Hələ tamam qurumamış yağış gölləri; Üzərində bulud-bulud uçur milçəklər.* S.Vurğun. ☐ **Göl bağlamaq** – bir yerə yığılıb qalmaq, axmamaq (mayelər haqqında). *Qan göl bağlamışdı. – Daşı ağzından götürüb gördüm ki, hinin içi göl bağlamış, var səsimlə*: *– Boğulmuş! – deyə bağırdım.* A.Şaiq.

2. *məc.* Təşbeh kimi bir şeyin çox olduğu "yer" mənasında. *Qəm gölündə üzmək. – Ələsgər qurbandı belə gəlinə; Sona kimi cumub eşqin gölünə.* Aşıq Ələsgər. *Bir dəstə cavan və igid oğlan ataş gölündə üzür, əridilmiş odda çimirdi.* Ə.Vəliyev.

◊ **Göl iyiri** *bot.* – yerlə sürünən kökümsov gövdəli çoxillik bitki.

**GÖL-GÖL** *zərf* Bəzi yerlər quru, bəzi yerlər su ilə dolu halda, su yığınları şəklində. *Axan çay göl-göl olub burulur və sonra yenə açılıb gedirdi.* S.Rəhimov. // Məc. mənada. *Göl-göl olub sirişkim, gülzar olub kənarım; Mən neyləyim baharı, ya bağü laləzarı.* S.Ə.Şirvani.

**GÖLLƏNDİRMƏ** "Gölləndirmək"dən *f.is.*

**GÖLLƏNDİRMƏK** *f.* Göl halına salmaq, göl kimi su yığmaq, gölməçə əmələ gətirmək. *Küçəni gölləndirmək.*

**GÖLLƏNMƏ** "Göllənmək"dən *f.is.*

**GÖLLƏNMƏK** *f.* 1. Göl halına düşmək, göl kimi su yığılmaq, gölməçə əmələ gəlmək. *Yağışdan küçələr gölləndi. – Bir gün Qəmər ağacların dibini çala edirdi ki, su göllənsin, ağaclar su içsin.* (Nağıl). *Orda-burda göllənmiş* (f.sif.) *suların içindən adamboyu hündürlüyündə göy qamışlar ucalırdı.* M.Hüseyn.

2. Təşbeh kimi "göz yaşı axıtmaq" mənasında. *Qanlı yaşım gündən-günə bollandı; Axdı, axdı sinəm üstə gölləndi.* M.V.Vidadi. *Anamın göz yaşı axıb gölləndi; Sonra saçlarını yolub dilləndi.* S.Vurğun.

**GÖLLÜK** *is.* Göl çox olan yer. // Sif. mənasında. *Göllük sahə.*

**GÖLMƏ** *dan.* b a x **gölməçə**. *Neft gölməsi. Su gölməsi. – Bu gölmələrdə balıq axtarırdıq.* S.S.Axundov. *Gölmə sularının rəngi sapsarı; Xəstəlik qurudur ağaclıqları.* S.Vurğun. *Ağcaqanad dəstə-dəstə; Vızıldadı gölmə üstə.* M.Dilbazi. ☐ **Gölmə bağlamaq (tutmaq)** – b a x **gölmələnmək**. *Çirk sular gölmə bağlayıb. – Su ancaq oyuqlarda, çuxurlarda gölmə tutardı.* S.S.Axundov.

**GÖLMƏC** *is.* Kiçik, balaca gölməçə; gölmə.

**GÖLMƏÇƏ** *is.* Kiçik göl, balaca göl, su və ya çirkab yığını. *Gölməçənin üstündən atlanmaq. Neft gölməçəsi. – Yol qıraqlarındakı sular və gölməçələr buz bağlamış, Savalanın*

*başı əbədi duman içində itmişdi.* M.İbrahimov. *Biz axmazların, gölməçələrin hamısını qurudacağıq.* Ə.Sadıq. *Gölməçələr gölə dönüb; Meşələrin çayına bax.* H.Arif.

**GÖLMƏÇƏLƏNDİRMƏ** "Gölməçələndirmək"dən *f.is.*

**GÖLMƏÇƏLƏNDİRMƏK** *icb.* Gölməçə əmələ gətirmək, suyu və ya başqa mayeni bir yerə yığmaq. *Buruğun ətrafını gölməçələndirmək.*

**GÖLMƏÇƏLƏNMƏ** "Gölməçələnmək"dən *f.is.*

**GÖLMƏÇƏLƏNMƏK** *f.* Gölməçə əmələ gəlmək, bir yerə yığılıb qalmaq; axmamaq. *Su küçədə gölməçələndi. – Göldən uzanıb gələn köhnə arxın bulanıq lehməli suyu taxılı basaraq gölməçələnirdi.* M.İbrahimov. *..Kim isə qayığın dövrəsində gölməçələnmiş* (f.sif.) *suyun içində ağır-ağır addımlayırdı.* M.Rzaquluzadə. *Elə bil illərlə axan al-qanın; Bayrağın dibində gölməçələndi.* B.Vahabzadə.

**GÖLMƏÇƏLİ** *sif.* Gölməçə olan, gölməçə əmələ gəlmiş. *Gölməçəli küçə. – Gölməçəli, zibilli o ucqar küçələrdə; Qaranlıq döngələrdə lal kölgələr sürünür.* Ə.Cəmil.

**GÖLMƏÇƏLİK** *is.* Gölməçə çox olan yer. *Gölməçəliyi qurutmaq.*

**GÖLMƏLƏNMƏ** "Gölmələnmək"dən.

**GÖLMƏLƏNMƏK** *dan.* bax **gölməçələnmək**. *Küçə gölmələndi.*

**GÖMDÜRMƏ** "Gömdürmək"dən *f.is.*

**GÖMDÜRMƏK** *f.* Basdırmaq, quyulamaq, torpağın altında gizlətmək.

**GÖMDÜRÜLMƏ** "Gömdürülmək"dən *f.is.*

**GÖMDÜRÜLMƏK** *məch.* Basdırılmaq, quyulandırılmaq, torpağın altında gizlədilmək.

**GÖMGÖY**[1] *sif.* Tünd-göy, tünd-mavi. *Gömgöy paltar. – Buludsuz, açıq, şəffaf, gömgöy səma birdən-birə bulanır..* M.Rzaquluzadə.

**GÖMGÖY**[2] 1. *sif.* Tünd-yaşıl, yamyaşıl; hər tərəfi yaşıl. *Gömgöy parça. – Quşlar gömgöy budaqlarda oturub oxuşurdular.* S.S.Axundov. *Ortada gömgöy otlarda atlaz kimi döşənmiş geniş bir meydan vardı.* M.Rzaquluzadə.

2. *zərf* Soyuqdan, hirsdən göyərmiş. *Hirsindən gömgöy olmaq. – İşləmiş qanına bu quduz şaxta; Qalın dodaqları gömgöy kəsilir.* S.Vurğun. [Şamxalın] *gicgahlarındakı damarlar gömgöy göyərib şişdi, az qaldı ki, partlasın.* İ.Şıxlı.

3. *is.* Zərbə və s. nəticəsində bədənin hər hansı bir yerində əmələ gələn tünd-göy ləkə. *Qonşular hələ o vaxt deyirdilər ki, Minayənin üzü-gözü gömgöydür, cırıq-cırıqdır.* Ə.Əbülhəsən. ☐ **Gömgöy göyərmək** – göy ləkələr əmələ gəlmək, bərk göyərmək. [Səriyyə:] *Hələ bu gün səhər məni o qədər vurublar ki, əndamım gömgöy göyərib.* C.Cabbarlı. *Özü yoxsul balası, həm də qərib; Üz-gözü gör necə gömgöy göyərib.* Ə.Vahid.

**GÖMGÖYLÜK**[1] *is.* Tünd-göy rəngdə olan şeyin halı; tünd-mavilik.

**GÖMGÖYLÜK**[2] *is.* Tünd-yaşıl rəngdə olan şeyin halı; yamyaşıllıq, tünd-yaşıllıq, hər tərəfi yaşıl olma.

**GÖMMƏ** "Gömmək"dən *f.is.*

**GÖMMƏK** *f.* 1. Basdırmaq, torpağa quyulamaq, torpağın altında gizlətmək. *Zavallı qocanı məzara gömdüm, həm də bir daha soyuq məzəmmətlərini eşitməmək üçün köhnə, çürük fəlsəfə və mühakimələri ilə bərabər gömdüm.* A.Şaiq. [Aydəmir:] *..Aydəmiri torpaqlara gömməmiş heç kəs onun ürəyinə toxunmaz.* C.Cabbarlı.

2. *məc.* Məhv etmək, puç etmək, yoxa çıxarmaq.

**GÖMRÜK** *is.* Ölkəyə gətirilən və ya ölkədən çıxarılan mallardan, şeylərdən alınan dövlət rüsumu. *Gömrük almaq. Gömrük pulu.* // bax **gömrükxana**. [Hacı Qara:] *Başına dönüm, on beş ildir padşah gömrüyünə ildə mən əlli tümən xeyir verirəm.* M.F.Axundzadə.

**GÖMRÜKÇÜ** *is.* Gömrükxana xidmətçisi.

**GÖMRÜKXANA** *is.* Ölkəyə gətirilən və ölkədən çıxarılan malları və ya şeyləri yoxlayıb gömrük rüsumu almaq işilə məşğul olan dövlət idarəsi. *Gömrükxana işçisi.* – [Əsgər bəy:] *Səbəbi odur ki, qarabağlıların, .. gömrükxana qarovullarının və kazakların qorxusundan quş quşluğu ilə Arazın o tayına səkə bilmir.* M.F.Axundzadə.

**GÖMRÜKLÜ** *sif.* Üzərinə gömrük qoyulmuş, gömrük alınan. *Gömrüklü mal.*

**GÖMRÜKSÜZ** *sif.* Üzərinə gömrük qoyulmamış, gömrük alınmayan. *Diplomatik işçilər üçün aparılan gömrüksüz mallar.*

**GÖMÜLMƏK** *məch.* 1. Basdırılmaq, quyulanmaq, torpaq altında gizlədilmək. *Kən-*

*dimizin ən yaxşı adamları orada torpağa gömüldü.* Ə.Məmmədxanlı. ◻ **Qaranlığa (zülmətə) gömülmək** – qaranlığa, zülmətə qərq olmaq, qaranlığa batmaq. *Maşının işığı qılınc kimi Mərdanın gözlərinə sancıldı. Sonra ustanın gözlərində hər şey qaranlığa gömüldü.* H.Seyidbəyli. *Aynabəndi sağ-soldan meyvə ağacları bürümüş, alçaq ev zülmətə gömülmüşdü.* İ.Hüseynov.

2. *məc.* Məhv edilmək, yox edilmək, puça çıxarılmaq. *Nə könlü açıldı, nə güldü qəlbi; Anamın torpağa gömüldü qəlbi.* O.Sarıvəlli.

**GÖN** *is.* İri heyvanların işlənmiş dərisi. *Ayaqqabının altı göndür. Gönü suya vermə, verdin heyfsilənmə.* (Ata. sözü). // Bu dəridən qayrılmış. *Gön altlıq.*

◊ **Gönü duzlamaq** *isteh.* – ölmək, gəbərmək. [Azad:] *Arvad gün-gündən saralır, deyəsən, bu da bacıları kimi gönü duzlayacaq, yenə xərcə düşüb təzədən evlənəcəyəm!* Çəmənzəminli. **Gönündən soymaq (çıxarmaq)** – zərərinin əvəzini birindən güclə almaq. [Həsən:] *Ziyanlığın hamısını sənin gönündən soyacağam.* Ə.Haqverdiyev. **Gönünü soymaq (almaq)** – 1) bərk cəzalandırmaq, divan tutmaq. [Ağa Kərim xan:] *Tez ol, yoxsa, vallah, gönünü allam.* N.Vəzirov. [Yaxşı:] *Qaynım dünən araba ilə şəhərə gedib. Yoxsa mən bura gələ bilərdim? Mənim gönümü soyardı.* C.Cabbarlı; 2) çox baha qiymətə satmaq, bahaçılıq etmək. *Müştərilərin gönünü soymaq.* **Dabbağxanada (dabbağda) gönünü tanımaq (gönünə bələd olmaq)** – b a x **dabbağxana**.

**GÖNÇÜ** *is.* Gönçülüklə məşğul olan adam.

**GÖNÇÜLÜK** *is.* 1. Gönçünün işi, peşəsi.

2. Gön istehsalı. *Gönçülüyü inkişaf etdirmək. – Mərgümüş təbabətdə, pirotexnikada, gönçülükdə, sarı rəng istehsalında və başqa sahələrdə işlənir.* M.Qaşqay.

**GÖNDƏRİLMƏ** "Göndərilmək"dən *f.is.*

**GÖNDƏRİLMƏK** "Göndərmək"dən *məch. Qoşun göndərilmək. Ezamiyyətə göndərilmək. Məktub lazımi yerə göndərildi.*

◊ **Sibirə göndərilmək** *köhn.* – Sibirə sürgün edilmək, katorqaya göndərilmək (keçmişdə Sibir sürgün, katorqa yeri sayılırdı). [Müstəntiq:] *Sənin Sibirə göndərilməyinə bu sənəd kifayət edər.* H.Nəzərli.

**GÖNDƏRİŞ** *is.* Göndərmə işi, göndərmə, yollama.

**GÖNDƏRMƏ** "Göndərmək"dən *f.is.*

**GÖNDƏRMƏK** *f.* 1. Yollamaq (birinə vermək, çatdırmaq üçün). *Məktub göndərmək. Sovqat göndərmək. Poçtla pul göndərmək.* – [Oğul:] *Ata, ayda on beş manat qardaşıma göndərə bilərsən?* Ə.Haqverdiyev. [Yaşlı kişi:] *Tək bir teleqram üzərinə biz* [tatar tacirinə] *vaqonlarla mal göndərirdik.* S.Hüseyn.

2. Bir tapşırıqla bir yerə yollamaq. *Uşağı dükana göndərmək.* [Əsgər:] *Günü bu gün Süleymanı görsəm göndərəcəyəm ki, gedib elçilik eləsin.* Ü.Hacıbəyov. *Məhəmməd Səfi ağa bir az səbr eləyib, xidmətçi qızı* [Alının] *dalınca göndərdi.* Çəmənzəminli. // Bir məqsədlə bir yerə getməsini əmr və ya təklif etmək; təyin etmək. *İdarəyə müdir göndərmək. İşə göndərmək. Uşaqları gəzməyə göndərmək.*

3. Ezam etmək, yollamaq. *Müşavirəyə göndərmək. Vətənə göndərmək. – Keçən gün seçkiqabağı məni seçicilər arasında kütləvi iş aparmaq üçün Xıdırlıya göndərdilər.* S.Rəhman. *Bakıda Firidunu növbəti çağırışçılara qoşub, Tbilisiyə göndərdilər.* Mir Cəlal.

4. Yazı, hərəkət və ya sözlə öz münasibətini, hissiyyatını bildirmək, ifadə etmək. *Salam göndərmək.*

◊ **Sibirə göndərmək** *köhn.* – Sibirə sürgün etmək. *..Səfəri adam öldürmək üstündə Sibirə göndərdilər.* S.S.Axundov.

**GÖNDƏRTMƏ** "Göndərtmək"dən *f.is.*

**GÖNDƏRTMƏK** *icb.* Göndərməyə, yollamağa məcbur etmək, yaxud göndərməsini xahiş etmək. *Övliya .. min-min manat bayramlıq göndərtdikdən sonra dübarə onunla barışardı.* İ.Musabəyov.

**GÖNLÜK** *sif.* Gön üçün aşılamağa yarar. *Gönlük dəri.*

**GÖNSOYAN** *sif.* 1. Kəsilmiş heyvanın gönünü soyan. *Gönsoyan qəssab. Gönsoyan maşın.*

2. *dan.* Çox bahaçı, bahacıl adam haqqında.

3. *məc.* Zülmkar, zalım, qəddar mənasında. *Dözə bilməz insan oğlu; Bu gönsoyan qanunlara!* S.Vurğun.

**GÖNÜQALIN** *sif.* 1. Dərisi kobud, qalın olan.

2. *məc.* Heç bir şeydən mütəəssir olmayan, heç bir şey kar etməyən; kobud, qanmaz. *Gönüqalın adam.* – [Süsənbər Səməndərə:] *..İstəyirəm ki, sənin o gönüqalın qayınatanın qarnına möhkəm bir ağrı dola..* B.Bayramov. // İs. mənasında. [Cəlal:] *..Aləmi xarablayan belə gönüqalınlardı da..* M.İbrahimov.

**GÖNÜQALINLIQ** *is.* Heç bir şeydən mütəəssir olmayan, heç bir şey kar etməyən adamın keyfiyyəti, xassəsi; qanmazlıq, kobudluq.

**GÖRDÜRMƏ** "Gördürmək"dən *f.is.*

**GÖRDÜRMƏK** *icb.* Görməyə məcbur etmək, görməsini xahiş etmək, görməsinə nail olmaq. *İş gördürmək.*

**GÖRƏ** *əd.* 1. Yönlük hal şəkilçisi tələb edərək: a) səbəb bildirir. *Yıxıldığına görə ayağı sındı. – Elə bax bu rəssamlığıma görə də məni lap gözdən salıblar.* S.Vəliyev; b) əsas, isnad bildirir. *Kişi yer üzündə od qoruyandır; Kişi ona görə kişi adlanır.* M.Araz.

2. Mürəkkəb bağlayıcının tərkib hissələrindən biri kimi işlədilib, özündən əvvəlki fikrin sonrakı fikrə səbəb olduğunu bildirir. *Yəqin başı qarışıqdır, ona görə kağız yazmır.* M.Hüseyn. *Mən səni qardaşlığa qəbul etmişəm, ona görə də bu cür açıq danışıram.* S.Rəhman.

**GÖRƏCƏK** b a x **görəcəkli**.

**GÖRƏCƏKLİ: görəcəkli günlərim (günlərimiz) varmış** – gözlənilməyən pis bir hadisə baş verdikdə və ya bir xəbər eşidildikdə deyilir. [Məşədi Səfər:] *Qoca vaxtımda görəcəkli günlərim varmış.* Ə.Haqverdiyev. [Sona xanım:] *Yazıq mənim canım, .. görəcəkli günlərim varmış.* Ə.Haqverdiyev. *Allah, görəcəkli günlərim varmış.* B.Vahabzadə.

**GÖRƏK** *əd.* 1. Nəticəsi qabaqcadan bəlli olmayan bir işə başlarkən deyilir. *Yaz görək nə çıxır.* – [Sitarə Gülzara:] *Gəl toyumuz barəsində niyyət eləyək, gedək bayıra, qulaq asaq, görək kim nə eşidir.* C.Cabbarlı. [Vəzir:] *Səbr ediniz, görək bu işin çarəsi nədir?* Ü.Hacıbəyov.

2. Fellərdən sonra gələrək narazılıq, yaxud təkidlik çaları verir. *Sən bir dayan görək. Qoy görək. De görək, nə deyirsən?*

**GÖRƏN**[1] b a x **görəsən**. [Durna:] *İndi yazıq Aydəmirin halı görən nə olar?* C.Cabbarlı. *Vurdu onu yol üstündə; Hansı zalım ovçu görən?* M.Dilbazi. *Görən nə düşündü, görən nə andı?* B.Vahabzadə.

**GÖRƏN**[2] *is. məh.* Sıra ilə otlama (qoyun haqqında). ☐ **Görən atmaq (bağlamaq)** – b a x **görənimək**. *Qoyun lalələikdə görən atmışdı.* H.K.Sanılı.

**GÖRƏNİMƏ** "Görənimək"dən *f.is.*

**GÖRƏNİMƏK** *f. məh.* Sıra ilə otlamaq (qoyun haqqında). *Qoyunlar güneylərdə görəniyir, keçilər .. kolların başını dişləyir.* Ə.Vəliyev.

**GÖRƏSƏN** *əd.* Sual, əndişə, maraq bildirir. *Görəsən, niyə gəlmədi? Görəsən, onun axırı necə oldu? Görəsən, xəstə sağalacaqmı? – Fikirləşir ki, görəsən, uşaq sözdə-söhbətdə də atasına çəkib, ya yox?* "M.N.lətif." *Görəsən, atası* [Buğacı] *niyə tək çağırmışdı?!* M.Rzaquluzadə.

**GÖRƏSİ** *sif.* Görməli, görülməli, görülməsi lazım gələn. *Görəsi bir işim yoxdur.*

◊ **Görəsi gözü olmamaq** – zəhləsi getmək, nifrət bəsləmək. *Əgər həqiqəti bilmək istərsiniz, Cəmilə xanımın ərindən zəhləsi gedirdi, onu görəsi gözü yox idi, könülsüz tikə kimi qəbul edirdi.* E.Sultanov.

**GÖR-GÖTÜR** *is.* Gördüyü, həyatında rast gəldiyi müsbət şeyləri mənimsəmə, öyrənmə; təcrübə qazanma. *Kiri, kiri, dünya gör-götürdür.* Mir Cəlal.

**GÖRK** *is.* Göstərmək işi, nümayiş, göstəriş. ☐ **Görk etmək** – göstərmək, nəzərə çatdırmaq. [Katib:] *Danışıqların düz olsa, Hümmətin bu hərəkətlərini açıb hamıya görk eləyəcəyik.* B.Bayramov. **Görk üçün** – göstərmək üçün, nümayiş etdirmək üçün, zahiri görünüş üçün. *Məzar üstə çoxu ağlar görk üçün; Ağlayırsan – sağlığımda ağla sən.* M.Araz.

**GÖRKƏM** *is.* 1. Xarici, ümumi görünüş. *Xarici görkəm. Yaxşı, səliqəli görkəmi var. Görkəmini dəyişmək. – Tanrı elə görkəm vermişdi ona; Görənlər az qala cadulanırdı.* Şəhriyar.

2. İnsanın daxili vəziyyətini, hissiyyatını, xasiyyətini əks etdirən sifəti, zahiri siması, görünüşü. *Zəhmli görkəm. Ciddi görkəm. Xəstə görkəm.* – [Məryəm] *gah sərt bir görkəm alıb Səlimə acıqlanır, gah özündən*

*kənar edirdi.* H.Seyidbəyli. □ **Görkəm almaq** – daxili vəziyyəti və hissiyyatı zahiri görünüşündə ifadə etmək. *Sərhəng Firiduna baxıb ciddi və bir az da sərt görkəm aldı..* M.İbrahimov.

3. Göz önündə açılan təbiət mənzərəsi; mənzərə, görünüş. *Meşənin görkəmi. – Hər yamacın bir baharı; Hər dağın bir görkəmi var.* M.Müşfiq. *Baharın öz görkəmi; Qışın da öz xətti var.* S.Rüstəm. *Dağ yolu hər yerdə bir görkəm alır; Meşədən keçərək, çaydan keçərək.* H.Arif.

4. Bax **görk**. *Aqrotexniki tədbirlərdən elə-belə görkəm üçün danışırdılar.* (Qəzetlərdən).

**GÖRKƏMLİ** *sif.* 1. Bu və ya başqa cür görünüşü, görkəmi, siması olan; görünən. *Xəstə görkəmli. Sağlam görkəmli. – Onların əvəzinə Tapdıq, özünə yaxınlaşan kərtənkələ görkəmli birisini və onun bıçaq kimi süngüsünü gördü.* Ə.Əbülhəsən. *Hər ikisi qızların bir-birindən qəşəngdi; Biri sakit görkəmli, biri ciddi, ürkəkli.* M.Dilbazi. // Gözəgəlimli. *Görkəmli oğlan.*

2. Müsbət xüsusiyyətlərinə görə başqalarından seçilən; yaxşı. *Görkəmli usta.* – [Qüdrət:] *Görkəmli mühəndislərin qəlbini oxumaqda çətinlik çəkdikcə trest bu vəziyyətdən çıxmayacaqdır.* M.Hüseyn. [Səməd] *idarənin ən görkəmli işçilərindən idi.* H.Seyidbəyli.

3. Böyük xidmətləri olan; məşhur, tanınmış. *Görkəmli bəstəkar. Görkəmli alim. – Mirzə o zamanın görkəmli şairləri – Zakir Qarabaği və Seyid Əzim Şirvani ilə dostluq edir və yazışırdı.* Ə.Haqverdiyev.

4. Böyük əhəmiyyətli; mühüm. *Görkəmli nəticələr çıxarmaq. – Buna nə ruhaniyyət alimi olmaq, nə də filosoflar içində görkəmli yer tutmaq kömək edə bilməzdi.* M.S.Ordubadi.

5. Hər tərəfdən görünən, hamının gördüyü. *Danışıqdan aydın oldu ki, o bizim idarədə görkəmli yerdən asılı bir şəkli – Həcərin ağ boya ilə işlənmiş şəklini istəyir.* S.Rəhimov.

6. Görməli, maraqlı, baxmalı, diqqətəlayiq. *Ədəbi görüşlərlə yanaşı, biz Volqoqradın görkəmli yerləri, abidələri və mədəniyyət ocaqları ilə tanış olurduq.* M.İbrahimov.

**GÖRKƏMLİLİK** *is.* 1. Görkəmli adam və ya şeyin hal və keyfiyyəti.

2. Məşhurluq.

**GÖRKƏMSİZ** *sif.* 1. Xarici görünüşü, görkəmi yaxşı olmayan, qəşəng olmayan, gözə xoş gəlməyən; nəzəri cəlb etməyən, nəzərə çarpmayan, görkəmcə maraqsız. *Görkəmsiz adam. – Axtar qısaboylu, gödəktüklü, boz rəngli, görkəmsiz tula idi.* S.S.Axundov.

2. Nəzəri cəlb etməyən, gözə çarpmayan. *Görkəmsiz mənzərə.*

**GÖRKƏMSİZLİK** *is.* Görkəmi, xarici görünüşü yaxşı olmayan, gözə xoş gəlməyən adam, ya şeyin hal və keyfiyyəti.

**GÖRKƏZMƏ** "Görkəzmək"dən *f.is.*

**GÖRKƏZMƏK** *dan.* bax **göstərmək**. *Əhməd də özünü yalandan heç bir şeydən xəbəri olmayan kimi görkəzib, guya təəccüb eləyirdi.* (Nağıl). *Aç üstün qabağın zər qəsabənin; Zülfün təxtəsini görkəz, bəri bax!* M.P.Vaqif.

**GÖRMƏ** "Görmək"dən *f.is. Görmə qabiliyyəti. Görmə siniri.*

**GÖRMƏK** *f.* 1. Gözləri ilə qavramaq. *Öz gözü ilə görmək. Evi görmək. Hadisəni öz gözümlə gördüm.* – [Telli:] *Vallah, xanım, elə görməmişdən ərə getmək lazımdır, yoxsa əvvəl görəndə daha sonra yaxşı olmur.* Ü.Hacıbəyov. // Görmə qüvvəsinə malik olmaq. *Gözüm zəif görür. Çeşməklə yaxşı görürəm.*

2. Təsadüf etmək, rastlaşmaq. *Nə vaxtdır onu görmürəm.* – [Səlim:] *Gəzdim, dolandım, uğradım hər yerə; Mən böylə bir qadın görmədim hələ.* H.Cavid. [Balaş:] *Heç bilmirəm nə edim? Qonaqlar da* [Atakişini] *görmək istəyir.* C.Cabbarlı. // Şəxsən görüşmək. *Müdiri görməyə getmək.* // Yoluxmaq, yoxlamaq, baş çəkmək. *Xəstəni görməyə getdi. Qız görmək üçün gedib. – Ceyran, oğlunu görmək bəhanəsilə hər gün Eldarın evinə gedir.* S.Hüseyn.

3. Başa düşmək, anlamaq, duymaq, hiss etmək. *Özüm görürəm ki, ... – Qəssab Alı gördü ki, bu müştəri lap göydəndüşmədi.* "Koroğlu". *Əşrəf gördü ki, hesabdarlıq Nazlının çox xoşuna gəlir.* S.Rəhman. // Hesab etmək, hiss etmək, tapmaq. *Mən burada pis bir niyyət görmürəm.*

4. Görməyə nail olmaq, qismət olmaq, nəsib olmaq. *Oğlunun toyunu görmək. Yaxşı*

*günlər görmək. – Səlma da aqibət xoş bir gün görür.* H.Cavid. *Uzaq deyil, bu gün-sabah görəcəyik o günləri; Yenə qanad açacaqdır eşq adlanan gözəl pəri.* S.Vurğun.

5. Təsəvvürünə gətirmək, fikrən təsəvvür etmək, xəyalına, gözünün qabağına gətirmək. *..Qəhrəman öz uşaqlıq günlərini görürdü.* S.Rəhimov. *Qambayev dəhşətli sonun yaxınlaşdığını görürdü.* S.Rəhman.

6. Müəyyən etmək, bəlli etmək, aşkara çıxarmaq. *Aşkardı ki, hər iş sahibi ilin axırında .. dəftərləri qoyar qabağına və başlar hesab etməyə ki, görsün qazancı nə olub və zərəri nə olub.* C.Məmmədquluzadə.

7. Çatmaq, bəs eləmək, kifayət etmək. *Bu çörək iki günə bizi görər.* – [Bədəl:] *Əvvəla, Rəhim xandan gətirdiyimiz sursat neçə müddət bizi görər?* Ə.Haqverdiyev.

8. *dan.* Görüşüb danışmaq, görüşüb məsləhətləşmək, razılığını almaq. *Onu görmək lazımdır. Adam görmək lazımdır. // məc. dan.* Qabaqca görüb rüşvət vermək. *Koxanı gör, kəndi çap.* (Ata. sözü). *Dövlətli qabaqcadan vəziri görmüş imiş, vəzir də hökmü təsdiq edir.* "M.N.lətif."

9. Etmək, icra etmək, yerinə yetirmək. [Mərcan bəy:] *Qoymursan ki, mən öz işimi özüm görüm.* Ü.Hacıbəyov. *Ballı .. çay tədarükü görməyə başladı.* A.Şaiq.

10. Şübhələnmək, təqsirləndirmək. *Kimdən görürsən? – Mərd Allahından görər, namərd yoldaşından.* (Ata. sözü). [Oğurluğu] *çayxana sahibi kəndlilərdən görürdü.* Mir Cəlal.

11. Keçirmək, çəkmək, giriftar olmaq, uğramaq. *Kasıblıq görmək. Çox çətinlik görmək. Xəstəlik görmək. – Bağın, əkinin xeyrini bəylər görəcəkmiş; Toxm əkməyə dehqanları neylərdin, ilahi?!* M.Ə.Sabir.

12. Gəzmək, yaşamaq, olmaq. *Çox yer görmək.*

13. Əmr şəklində **gör** – a) təəccüb, heyrət bildirir. *Gör nə gözəl oxuyur. Gör nə qədər adam var. Gör nə böyük ilandır. Gör necə özündən çıxır;* b) bax gör, yoxla, öyrən mənasında. *Gör o hara getdi. Gör bir şey öyrənə bilərsənmi? Gör bacara bilərsənmi?* c) hədə, qorxu bildirir. *Gör ona nə toy tutacaqlar. Gör onun dərsini necə verəcəyəm.*

14. **Görək** şəklində – intizar, qeyri-müəyyənlik bildirir. *Görək bu işdən nə çıxar? Görək axırı nə olar?*

15. **Görüm** şəklində – a) təkid, israr bildirir. – *Ə, de görüm, niyə mürüvvətin yoxdur, hə? .. – deyə, Xəlil ani və sərt bir nəzərlə Şahmara baxıb, yenə gözlərini çəkdi.* M.Hüseyn; b) arzu, istək bildirir. Görüm *böyük oğlan olasan.* – [Məsmə:] *O ki uşaqları oxutmaq, adam eləmək istəyir, onu görüm yüz yaşasın!* Mir Cəlal.

16. Bir sıra isimlərdən sonra gələrək mürəkkəb feil və müxtəlif ifadələr əmələ gətirir; məs.: *məsləhət görmək, isti-soyuq görmək, yolunu görmək.*

◊ **Gördüm deyən olmadı** – heç kəs görmədi, tapılmadı, itdi, yoxa çıxdı. *Cənnətəli Nurəddin ilə bərabər beş gün qohumunu axtardı, amma gördüm deyən olmadı.* S.S.Axundov. **Gördüyünü götürmək** – gördüyü şeyi yadda saxlamaq, tez mənimsəmək, tez öyrənmək, zehnən qavramaq. *Uşaq gördüyünü götürər. – Sarı qayda-qanunu nisbətən çox tez qavrayırdı və gördüyünü götürürdü.* S.Rəhimov. **Görməyə gözü olmamaq** – zəhləsi getmək, qətiyyən xoşu gəlməmək, nifrət etmək. *..Vəzir-vüzəranın Molla Nəsrəddini görməyə gözləri yox idi.* "M.N.lətif.".

**görə-görə** *zərf* Bir şeyi gördüyü halda, bildiyi halda, bilə-bilə. [Yusif:] *Görə-görə özümü cürbəcür bəlalara giriftar edirəm..* N.Nərimanov. [Fərhad:] *Ana, gərək sən də mənim kimi oğrunu görə-görə xalq sözünə qulaq asmaya idin.* Ə.Haqverdiyev.

◊ **Göz görə-görə** – göz gördüyü halda, hamının gözü qabağında, açıq-aşkar. *Göz görə-görə oğurlamaq.* – [Hacı Sultan] *..göz görə-görə başqasının udmasına razı ola bilmirdi.* S.Hüseyn.

**GÖRMƏLİ** *sif.* 1. Görülməsi lazım olan, görülməsi, yerinə yetirilməsi vacib və zəruri olan. *Görməli iş.*

2. *məc.* Görməyə, baxmağa dəyər, diqqətəlayiq, ən yaxşı. *Şəhərimizin görməli yerləri. Görməli abidələr.* – [Qızyetər Yarməmmədə:] *Bəri gəl, görməli şeylər var, sədr qaçmaz, lazım olanda özü səni tapacaq.* M.İbrahimov. *Su dağdan elə hücumla çıxır ki, köpüyə dönür, çıldırıb dörd yana dağılır. Görməli yerdir.* R.Rza.

**GÖRMƏMİŞ** *is.* Birdən-birə əlinə düşən şeyə qarşı özünü saxlaya bilməyərək acgözlük və yersiz hərəkətlər göstərən adam haqqında. *Qamış ola, camış ola; Özü də görməmiş ola.* (Ata. sözü). *Lovğalanıb, a görməmiş, çox da belə fırıldama! Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama!* M.Ə.Sabir. // Sif. mənasında. *Görməmiş adam.*

**görməmiş-görməmiş** *zərf* 1) görməmiş adam kimi. [Bəy:] *Ə, kəs, görməmiş-görməmiş danışma!* S.Rəhimov; 2) görmədiyi, tanımadığı, bilmədiyi, bələd olmadığı halda. *Görməmiş-görməmiş birisi haqqında danışmaq.*

**GÖRMƏMİŞLİK** *is.* Görməmiş adamın göstərdiyi yersiz hərəkətlər, bir şeyə qarşı görməmişcəsinə münasibət; acgözlük, tamahkarlıq. *Belə bir görməmişliyi, ya şöhrətpərəstliyi Mürsələ yaraşdıra bilmirəm.* Mir Cəlal.

**GÖRMƏZ-BİLMƏZ** *zərf* Görmədən, yaxşı tanımadan, öyrənmədən. [Mərcan bəy:] *Əlbəttə, insan gərək arvada əvvəlcə aşiq ola, sonra ala. Yoxsa görməz-bilməz alırıq, sonra da peşman olub qovuruq.* Ü.Hacıbəyov.

**GÖRMƏZLİK** *is.* Görmək qabiliyyətindən məhrumluq; görməmə, korluq. ☐ **Görməzliyə vurmaq (salmaq)** – qəsdən özünü görməyən kimi göstərmək.

**GÖRSƏDİLMƏ** "Görsədilmək"dən *f.is.*

**GÖRSƏDİLMƏK** *f.* Göstərilmək.

**GÖRSƏNMƏ** "Görsənmək"dən *f.is.*

**GÖRSƏNMƏK** bax **görünmək**. *Dedi: aya nədir bu dadə səbəb! Halətin görsənir nəzərə əcəb!* S.Ə.Şirvani. [Hərəmağası:] *Qız ulduzların arxasında gizlənir, arabir görsənir, təkrar gizlənir, mənimlə oynayır.* Çəmənzəminli. *Uzaqdan baxanda o gözəl Şəki; Görsənir dağlardan asılmış təki.* H.K.Sanılı.

**GÖRSƏTMƏ** 1. "Görsətmək"dən *f.is.*

2. *dan.* Əcaib, qeyri-adi, görünməmiş şey.

**GÖRSƏTMƏK** bax **göstərmək**.

**GÖRÜKMƏ** "Görükmək"dən *f.is.*

**GÖRÜKMƏK** bax **görünmək**. *..Amma mən* [Sadıqdan] *bir az cavan görükürəm.* C.Məmmədquluzadə. [Oğru:] *Bəy, and olsun o görükən imamzadəyə, mənim xəbərim yoxdur.* Ə.Haqverdiyev. *Küçələrdə bizim adamlardan bir kəs də olsa görükmürdü.* M.S.Ordubadi.

**GÖRÜLMƏ¹** "Görülmək¹"dən *f.is.*

**GÖRÜLMƏ²** "Görülmək²"dən *f.is.*

**GÖRÜLMƏK¹** "Görmək¹"dən *məch.*

**GÖRÜLMƏK²** bax **görünmək** 1-ci mənada. *Alçalsın dağları, görülsün köçü; Cənnəti məvadı qoynunun içi.* "Qurbani".

**GÖRÜM** bax **görkəm**. *Görümü yaxşıdır. Görümü yoxdur.*

**GÖRÜMLÜ** *sif.* Yaxşı görünən, nəzərə çarpan. *Televizoru görümlü yerə qoymaq.*

**GÖRÜNMƏ** "Görünmək"dən *f.is.*

**GÖRÜNMƏDƏN** *zərf* Yayınaraq, gözə çarpmadan, gizli, başqası görmədən. *Kimsəyə görünmədən getdi.*

**GÖRÜNMƏK** *f.* 1. Gözlə qavranılmaq, göz qarşısına çıxmaq, nəzərə çarpmaq. *Uşaq kimi görünmək. – Qonşu toyuğu qaz görünür qonşuya; Seyyid, öz yarıvı tut, özgə nigarı nə gərəkdir.* S.Ə.Şirvani. *Ancaq sol tərəfdə vağzalın çıraqları parlaq görünürdü.* S.M.Qənizadə. *Otağınküncündə bir dəyirmi masa görünürdü.* Çəmənzəminli.

2. Zahir olmaq, peyda olmaq, nəzərə dəymək. *O gecənin sabahı Sarıköynəyin əri yenə kənddə göründü.* S.Hüseyn. *Qırx-əlli il bundan əvvəl kəndin yaxınlığında bir pələng görünmüşdü.* A.Şaiq. [Gəldiyev] *gündüz iki saat idarəyə qaçıb görünür, qayıdırdı.* Mir Cəlal. // Müəyyən bir təsir bağışlamaq. *Zahirən zəif görünür. – Bu keyfiyyət olara xeyli qəribə göründü.* M.F.Axundzadə.

3. Hesab edilmək, ...kimi gəlmək. *Cənnət kimi görünmək. – Bax, yalançı tapıldı çünki çoban; Doğru derkən sözü göründü yalan.* M.Ə.Sabir. [Ruqiyyə:] *Onu-bunu mən bilmirəm, sizin əhalidən bizim əhali təmiz görünür.* A.Divanbəyoğlu.

4. *dan.* Bir yerə gəlmək, təsadüf edilmək (əsasən inkar şəklində işlədilir). *Çoxdandır görünmürsən. – Lətifə yenə də görünmürdü.* M.Hüseyn.

5. **Görünür, görünür ki** şəklində – "deyəsən", "yəqin" mənasında ehtimal bildirir. [Cəmil bəy Bəypolada:] *Görünür ki, bizim yerin adətindən əsla xəbəriniz yoxdur.* H.Cavid. [Asya:] *Görünür ki, qız gədəyə çox bənd olubdur.* Ü.Hacıbəyov.

**GÖRÜNMƏZ** *sif.* 1. Görünməmiş, bu vaxta qədər olmamış; qəribə, təəccüblü, əcaib.

[Nəbi:] *Heç görünməz iş? …Udubdur!* S.S.Axundov.

2. Görünməyən, açıqda olmayan, gizli. *..Kimisi örtülü bazarın görünməz bir guşəsində öz ticarət yerini rahatlayırdı.* S.Rəhimov. *Sanki görünməz .. bir əl uzanaraq Mayanın qanadlarını doğrayıb yerə tökmüşdü.* M.İbrahimov. ◻ **Görünməz olmaq** – gözdən itmək, daha görünməmək. *Qaranlıqda görünməz olmaq. – Günəş dağlar arasına keçərək görünməz olduqda mən də şəhərə daxil oldum.* S.S.Axundov. *Qaraltılar uzaqlaşıb görünməz oldular.* M.Hüseyn.

**GÖRÜNÜŞ** *is.* Bir şeyin və ya adamın zahiri şəkli, görkəmi. *Görünüşdən* [Almurada] *50 yaş ancaq vermək olardı.* İ.Əfəndiyev. *Mahmuda xarici görünüşünə görə paxıllıq edənlər də olurdu.* S.Vəliyev.

**GÖRÜNÜŞLÜ** *sif.* Bu və ya başqa görünüşü, görkəmi olan, görünən, nəzərə çarpan. *Qoçaq görünüşlü gənc. Yaxşı görünüşlü bağça. – Başında kələğay, kəndin dilbəri; Sadə görünüşlü bir gözəl pəri.* R.Rza.

**GÖRÜŞ** *is.* 1. Görmə işi, görmə qabiliyyəti, görmə. *Yaxşı şəkil çəkmək uşaqların görüş və müşahidə bacarığını artırır.* "Az. məkt."

2. İki və ya bir neçə nəfərin əvvəlcədən müəyyənləşdirilmiş vaxtda və yerdə təyin etdikləri görüşmə. *Görüş təyin etmək. – Firidun və Kərimxan Azadi ehtiyat üçün ikinci bir görüş yeri də təyin etmişdilər.* M.İbrahimov. // İki sevgilinin görüşməsi. *Görüşə getmək. – Dilşad Fəxrəddinin görüşə gəlməyəcəyini yəqin etsə belə, yenə haman görüş yerinə getməyə tələsirdi.* M.S.Ordubadi. // Uzaq bir yerdən gəlmiş adamla görüşmə. [Məmmədhəsən əmi:] *..Birisi getdi ziyarətə, gəldi evinə, heç kəs getmədi onun görüşünə.* C.Məmmədquluzadə. *Müəllimin gəlməsindən xəbər tutan kəndlilər axşam onun görüşünə gəldilər.* S.Hüseyn. // Görkəmli bir şəxslə tanış olmaq və söhbət etmək üçün təşkil edilən məclis. *Görüş saat 5-də olacaqdı.*

3. Yarışma, yarış. *Dostluq görüşü.*

4. Məhbusla onun qohumlarının icazə ilə rəsmi görüşməsi. *Görüş vermək. Görüş almaq. Görüş vaxtı qurtardı. – Günortadan xeyli sonra* [Kərimxanı] *ölüm kamerasından çıxarıb balaca və nəm iyi verən görüş otağına apardılar.* M.İbrahimov.

5. Hadisələrə, fikirlərə və ya başqa şeyə verilən qiymət, onlar haqqında rəy, fikir, nöqteyi-nəzər. *O yaşda olan bu qocada bu görüş, bu yenilik bizdə görünməmiş şeydir.* A.Şaiq. "*Molla Nəsrəddin*"*in ictimai görüşləri, ideal və meyilləri tezliklə hamıya bəlli oldu.* M.İbrahimov.

**GÖRÜŞDÜRMƏ** "Görüşdürmək"dən *f.is.*

**GÖRÜŞDÜRMƏK** *icb.* Görüşmələrinə vasitəçi olmaq, görüşə sövq etmək, görüşmələrinə nail olmaq, dilə tutub, bəhanə tapıb görüşməyə aparmaq. *Sevgililəri görüşdürmək.* [Səba xanım:] *..sənin Dilşad haqqındakı məhəbbətin baqidirsə, o zaman sizi görüşdürmək üçün kömək edə bilərəm.* M.S.Ordubadi.

**GÖRÜŞMƏ** "Görüşmək"dən *f.is.*

**GÖRÜŞMƏK** *qarş.* 1. Bir-birini görmək. [Yusif:] *On ildir ki, Şamdan ilə görüşməmişəm.* N.Nərimanov. *Hacı onun otağına adam göndərib görüşmək istədiyini bildirdi.* M.S.Ordubadi.

2. Əl verib salamlaşmaq, hal-əhval soruşmaq. *Üç həftə əvvəl, Mehriban bütün fəlakətlərinə* [Naşad əfəndinin] *səbəb olduğunu söylədikdə, Səlim onunla xüsusi surətdə görüşmüşdü.* S.Hüseyn. *Yoldaşları Eldarla köhnə və yaxın bir dost kimi görüşdülər.* M.Rzaquluzadə.

3. Əl verib sağollaşmaq, xudahafizləşmək. *Ev sahibləri ilə görüşdüm, salamatlaşdım, mənzil haqqını artıqlığıca verdim və çıxdım küçəyə.* C.Məmmədquluzadə. *Görüşüb qocadan ayrıldı Polad; Yollarda quş kimi açdı qol-qanad.* A.Şaiq. *Biz Eldarla görüşüb ayrıldıq və ona söz verdim ki, bir də göyərçinə güllə atmayacağam...* M.Rzaquluzadə.

4. Bir məqsədlə birilə görüşüb danışmaq, məsləhətləşmək. *Müdirlə görüşmək. – Mən sizə məsləhət görürəm, gedib cəmiyyətin sədri Həsən ağa ilə görüşəsiniz.* Ə.Haqverdiyev.

5. Gəzmək, dostluq etmək (qızla oğlan haqqında). *Qız, Teymurla cəmisi iki ay görüşmüşdü.* H.Seyidbəyli. *Su gəldi bağa, neylim? Dəydi yarpağa, neylim? Görüşürük bağçada; Gəlmir otağa, neylim?* (Bayatı). [Rüstəm bəy:] *Mən sənə izin verirəm ki, sən gedib onun ilə görüşəsən.* Ü.Hacıbəyov. ◻ **Görüşə getmək** – bir-birini görmək (qızla oğlan haqqında).

6. Təsadüfən bir-birinə rast gəlmək, təsadüf etmək, rastlaşmaq, üz-üzə gəlmək. [İbn Yəmin:] *Aylarca əgərçi ayrı düşdük; Qismət bu, yenə bu gün görüşdük.* H.Cavid. *Bir dəfə sabah saat yeddidə bir fabrikin qapısında bir dəstə işarayanlar arasında Mansurla görüşdük.* Çəmənzəminli. *Tez çatsın əlimiz bərkə düşərsək*; *Zorlu qoşun ilə biz görüşərsək.* H.K.Sanılı.

**GÖSTƏRİCİ** *is. xüs.* 1. Bir şeyi göstərmək, diqqəti cəlb etmək üçün mexanizm, qurğu, alət, cihaz və s. *Stansiyanın işıq göstəricisi. Yol göstəricisi. Manometrin göstəricisi.*

2. Bir işin, prosesin gedişi haqqında müəyyən təsəvvür yaradan rəqəm, cədvəl və s. *Eyvaz Gülşənə məsləhət gördü ki, lazım olan rəqəmləri və iş göstəricilərini yazıb götürsün.* Ə.Vəliyev.

◊ **Göstərici barmaq** *dan.* – şəhadət barmağı.

**GÖSTƏRİLMƏ** "Göstərilmək"dən *f.is.*

**GÖSTƏRİLMƏK** "Göstərmək"dən *məch.* [Xəlilə] *Xədicə göstərilib, əvəzinə dul anası gəlin gəlmişdi.* Çəmənzəminli. [Murad:] *Deyirlər sabah yaxşı film göstəriləcək.* İ.Əfəndiyev.

**GÖSTƏRİŞ** *is.* Nə etmək, necə hərəkət etmək haqqında əmr, təlimat, məsləhət, izahat. *Göstəriş almaq. Göstəriş vermək. Göstərişi yerinə yetirmək.* – *..Üç saat məktəbdə keçirdiyi vaxtdan başqa, günün yerdə qalanını Əmiraslan hər bir əmr və göstərişdən azad idi.* S.S.Axundov. *Hansı göstərişlə gəlibmiş, görən, Silahsız kütləni bu qıran ordu?* B.Vahabzadə. // Məsləhət, mülahizə. *Həkimin göstərişi.*

**GÖSTƏRMƏ** "Göstərmək"dən *f.is.*

**GÖSTƏRMƏK** *f.* 1. Görməsinə imkan yaratmaq; görsətmək. *Evləri cərgələmə; Tikilmiş cərgələmə; Açma günəş camalın; Göstərmə hər gələnə.* (Bayatı). *Gah göstərdin, gah gizlətdin yanağı*; *Axır məni dərdə saldın, al etdin.* M.P.Vaqif. [Cahan xala:] *Arşın mal aparmışdım, qızlara göstərəm.* Ü.Hacıbəyov. // Baxmaq, yoxlamaq üçün təqdim etmək. *Sənədlərini göstərmək.* // İzahat verərək tanış etmək. *Otaqlarını göstərmək. Eksponatları göstərmək.* – *Pişxidmətbaşı və Xacə Mübarək düşdülər qabağa, bir-bir əndərun otaqlarını göstərməyə şüru etdilər.* M.F.Axundzadə. *Kişi axunda yem yeyən atlarını göstərib, fəxr edirdi.* Mir Cəlal. // Tamaşaçılar qarşısında nümayiş etdirmək. *Yeni tamaşa göstərmək. Yeni film göstərmək. Tələbələrə kimyəvi təcrübə göstərmək.*

2. Müayinə edərək baxmaq, məsləhət almaq üçün gətirmək. *Uşağı həkimə göstərmək. Dissertasiyasını rəhbərinə göstərmək.*

3. Əl və ya baş hərəkəti ilə birinin diqqətini bir şeyə cəlb etdirmək, nişan vermək, işarə etmək. *Evi göstərmək. Yolu göstərmək. Əli ilə pəncərəni göstərmək.* – [Cavad] *əlilə düşmən sərhədlərini göstərərək dedi..* Ə.Vəliyev. *Ovçu, Elçinin göstərdiyi yerə baxanda, burnuna yel doldu..* M.Rzaquluzadə. // Təqdim etmək. *Anam qızlara yer göstərib oturtdu və sonra bacımı və məni göstərərək tanış etdi.* S.S.Axundov.

4. Bədii əsərdə təsvir etmək, əks etdirmək. *Xalqın qəhrəmanlığını göstərmək. Əsərdə əmək adamlarının rəşadətini göstərmək.*

5. Şərh etmək, izah etmək, anlatmaq, başa salmaq. *Təcrübənin gedişini göstərmək. Cihazlardan istifadə qaydalarını göstərmək. Məsələnin həllini göstərmək.*

6. Bəlli etmək, şəhadət etmək. *Bu söz onun niyyətini açıq göstərir.*

7. Hər hansı bir keyfiyyət, xüsusiyyət, hal büruzə vermək, aşkar etmək. *Cəsarət göstərmək. Bacarıq göstərmək. Alicənablıq göstərmək.* – *Qulac qollarımı gərrəm; Meydanda hünər göstərrəm.* "Koroğlu". *Şah buyurdu ki*: *– Sizi bir əmrdən ötrü məsləhətə çağırmışam, gərək haman xüsusda bir tədbir göstərəsiniz.* M.F.Axundzadə. *Mirzə Səfərin kiçik oğlu başladı dövlətli balalarına dərs verməyə, müəllimlikdə qabiliyyət göstərdiyindən işləri gün-gündən tərəqqi etməkdə idi.* Ə.Haqverdiyev. // Kəmiyyətcə bu və ya başqa nəticələr vermək. *Qaçışda yaxşı nəticə göstərmək. Təyyarə ən yüksək sürət göstərdi.*

8. Bildirmək, demək və ya yazmaq. *Bəhmənyar göstərir... Müəllif göstərir ki...*

9. **Göstərərəm, göstəririk, göstərər(lər)** şəklində *dan.* – təhdid, hədə mənasında. *Mən sənə göstərərəm... Ona göstərərlər...* – [Zaman:] *Mənim ixtiyarım yoxdur? Mürtədin qızı, yoxsa mən ata deyiləm? İmdi mən sənə öz ixtiyarımı göstərərəm.* Ə.Haqverdiyev.

**GÖTÜRƏ** *sif. iqt.* Hasil edilmiş şeyin miqdarına görə əmək haqqı vermə üsulu. *Götürə iş üsulu ilə işləmək. – Bunun üçün də götürə işin tətbiqini .. bacarmaq lazımdır.* Mir Cəlal.

**GÖTÜRƏÇİ** *is.* Götürə iş üsulu ilə əmək haqqı alan işçi.

**GÖTÜRƏÇİLİK** *is.* Götürə iş üsulu ilə işləmə, götürə iş. *Bütün tarla işləri xırda qruplarla və fərdi götürəçilik əsasında görülə bilər.* "Pambıqçılıq".

**GÖTÜR-QOY** *is.* Mülahizə, fikir, məsləhət, müzakirə. *Bir çox götür-qoydan sonra qızlar səpini qurtaran kimi Xanpərinin sahəsinə getməyi qərara aldılar.* Ə.Vəliyev. *Bütün bu tərəddüdlər və götür-qoylardan bezikən Sona, çarşabına bürünüb həyətdən çıxdı.* Ə.Əbülhəsən. *Nəcəfalıgildə götür-qoy uzun çəkdi.* B.Bayramov.

◊ **Götür-qoy etmək (eləmək)** – mülahizə etmək, ətraflı fikirləşmək, müzakirə etmək, ölçüb-biçmək. *Biz çox götür-qoy etdikdən sonra yenə də onun evinə girməyi, hərgah müqavimət göstərərsə edam etməyi qərara almışdıq.* M.S.Ordubadi. *Kosa çox götür-qoy etdikdən sonra .. qara qıfılı qapıya bənd etmiş və yollanıb kəndə getmişdi.* S.Rəhimov. *Bütün əhvalatı o dönə-dönə; Götür-qoy eləyir bir də dərindən.* B.Vahabzadə.

**GÖTÜRMƏ** "Götürmək"dən *f.is.*

**GÖTÜRMƏK** *f.* 1. Əlinə almaq, əlinə alıb qaldırmaq. [Xanməmməd] *yaşıl çuxasının qollarını çiyninə atıb, .. heç bir təklif olmadan süfrədən halva götürüb ağzına qoydu.* Çəmənzəminli. [Adil:] *Təndirdən yenicə çıxmış isti çörəkləri götürüb alverə yollandım.* B.Bayramov. *Əziz çamadanı götürüb pilləkənlərlə yuxarı qalxdı.* S.Rəhman. // Qaldırmaq. *Ayaqlarının birini götürüb o birini qoyur.* Ü.Hacıbəyov. *Fətulla .. başını yastıqdan götürməyə, dirsəklənməyə çalışdı.* Mir Cəlal.

2. Dəfn etmək üçün aparmaq, qaldırmaq (cənazə haqqında). *Cənazəni götürmək. – Qərib öldü, götürün; Dar küçədən ötürün; Qəribin vay xəbərin; Anasına yetirin.* (Bayatı).

3. Özü ilə bərabər aparmaq, yanınca aparmaq. – [Kərbəlayı Nənəxanıma:] *Mən palazı satım, sən də sabah məşşatəni tap, götür, get qız axtarmağa.* Çəmənzəminli. *Müəllim ehtiyat üçün məktəb xidmətçisi Mahmud əmini də götürdü.* B.Talıblı. [Məzlum:] *Həyat fırtınası məni yad torpaqlara götürüb çıxarmışsa, özüm də ağciyər olmuşam..* S.Vəliyev.

4. Öz tərkibinə almaq, qəbul etmək, daxil etmək. *Rəşid oğlana üz tutdu: – Səni qulluğa götürmək mənim boynuma.* M.Hüseyn. *Əbili uşaq evinə götürdülər.* Ə.Vəliyev.

5. Qavramaq, yadda saxlamaq, öyrənmək, mənimsəmək. *Ülkərlə Səttar çox zehinli uşaq idilər, müəllim dediyi sözləri əlbəəl götürüb tutuquşu kimi rəvan eləyirdilər.* (Nağıl). *On üçümdə məclislərdə oturdum; On dördümdə hər nə varsa götürdüm.* Aşıq Qurban.

6. Əldə etmək, məhsul almaq. *Bol məhsul götürmək.*

7. Hər tərəfə yayılmaq, bürümək, basmaq, yayılmaq, qaplamaq, sarmaq. *Qəflətən bir qorxulu səs meşəni götürdü.. Faytonçu dedi: – Qorxma, xanım, bayquşdur ulayır.* S.S.Axundov. *Qədim dayı küncə çəkilib, xurcunu başının altına qoydu, bir azdan xorultusu çayxananı götürdü.* S.Rəhimov. *Həyəti götürən soğan, qovurma, zəfəran iyi adamı valeh edirdi.* Mir Cəlal.

8. Nəzərə almaq, misal çəkmək, nümunə gətirmək (bu mənada adətən "götürək" şəklində işlənir). [Süleyman:] *Məsələn, götürək, bizim cavan tacirimiz Əsgəri..* Ü.Hacıbəyov.

9. Xərc tələb olunmaq, sərf olunmaq; xərclənmək, başa gəlmək. *Kostyum 60 manat götürdü.* – [Möhsünzadə:] *Bir iyirmi manat da uşaqların və Mehribanın əyni-başı götürər.* S.Hüseyn. [Böyük oğlu:] *Üç manat* [doktora] *verdim, iki manat on altı qəpik də dərmanları götürdü.* Qantəmir.

10. Başlamaq, şüru etmək, ibtidasını qoymaq.

11. Hirsləndirmək, əsəbiləşdirmək, qızışdırmaq, bərk təsir etmək. *Təklifim onu götürdü. – Söz Hacı Manafı götürmüşdü.* S.Hüseyn. *Qızın sözü Nərgizi bərk götürdü.* Ə.Məmmədxanlı.

12. Əxz etmək, almaq. *Mövzunu folklordan götürmək. Fikri başqasından götürmək. Söz götürmək.*

13. Dözmək, təhəmmül etmək, qəbul etmək. *Söz götürmək.*

14. Çıxarmaq (baş geyimləri haqqında] *Papağı götürmək. Oğlan şlyapasını götürdü.*

15. Yemək, dadmaq. *Kababdan bir tikə götürdü.*

16. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldir; məs.: od götürmək, əl götürmək, çimdik götürmək, boynuna götürmək.

**GÖTÜRTDÜRMƏ** "Götürtdürmək"dən *f.is.*

**GÖTÜRTDÜRMƏK** b a x **götürtmək**.

**GÖTÜRTMƏ** "Götürtmək"dən *f.is.*

**GÖTÜRTMƏK** *icb.* Götürməyə məcbur etmək, götürməsinə səbəb olmaq. *Xacə Mübarək şeyləri iki nəfər fərraşa götürdüb getdi.* M.F.Axundzadə. [Zərrintac] *öz çamadanlarını şəxsən Müqim bəyə götürdüb ağ atlı faytona qoydurdu.* S.Rəhimov.

**GÖTÜRÜBBƏ** *zərf dan.* Birdən, cəld, gözlənmədən. *Götürübbə qaçmaq.*

**GÖTÜRÜLMƏ¹** "Götürülmək¹"dən *f.is.*

**GÖTÜRÜLMƏ²** "Götürülmək²"dən *f.is.*

**GÖTÜRÜLMƏK¹** *məch.* 1. Ələ alınaraq qaldırılmaq. *Çamadan götürüldü. //* Dəfn etmək üçün qaldırılmaq (cənazə haqqında). *Cənazə saat 5-də götürüldü.*

2. Özü ilə bərabər, yanınca aparılmaq. *Uşaq kəndə götürüldü.*

3. Qəbul olunmaq, daxil edilmək. *Dəstəyə götürülmək. İşə götürülmək.*

4. Əldə edilmək, məhsul alınmaq. *Bol taxıl götürüldü.*

5. Ləğv edilmək, qaldırılmaq. *Qadağan saatı götürüldü.*

6. Əxz edilmək, alınmaq. *Söz dialektdən götürülmüşdür. Mövzu xalq həyatından götürülmüşdür.*

7. Çıxarılmaq (baş geyimləri haqqında). *Mazut iyi verən qabarlı əllər tərpənir, mazutlu papaq və şapkalar götürülür.* M.İbrahimov.

8. Yox olmaq, aradan çıxmaq. *Ey vah ki, heysiyyəti-millət götürüldü; Millətdə olan büsbütün adət götürüldü.* M.Ə.Sabir. *Tutaq ki, zülm lap götürüldü.* C.Məmmədquluzadə. [Daşdəmir] *kəndin işlərini gələn kimi düzəltdi. Oğurluq, quldurluq tamamilə götürüldü.* N.Nərimanov.

**GÖTÜRÜLMƏK²** *qayıd.* Birdən, gözlənilmədən, yerindən qaçmağa başlamaq; birdən qaçmaq. *Uşaq götürüldü. At götürüldü. – Birdən boz at ucadan kişnədi, qulaqlarını qırpa-qırpa aşağılarda otlayan ilxıya baxdı və qəfildən götürüldü.* M.Hüseyn. *Qürbət xala kağızı alıb götürüldü.* Mir Cəlal.

**GÖTÜRÜM¹** *is.* Dözüm, tab, taqət, qüvvət. *Götürümü yoxdur.* □ **Götürüm düşmək** – əldən düşüb tərpənmədən uzanmaq, tərpənməyə halı olmamaq. *Şamil, götürüm düşmüş öküz kimi yanlarını basa-basa yeriyib şenliyin qazma dam-daşları arasında gözdən itdi.* M.Hüseyn.

**GÖTÜRÜM²** *is. xüs.* Adətən mexanizmin bir dəfədə şey götürmə qabiliyyəti, gücü. *Maşının yük götürümü. Kotanın götürüm eni.*

**GÖTÜRÜMLÜ** *sif.* Səbirli, dözümlü, götürümü olan. *Götürümlü adamdır.* – [Budaq:] *Mən əvvəldə demişdim ki, anam götürümlü, səbirli arvad idi.* Ə.Vəliyev. [Abbas:] *Sən götürümlü rəhbərlərdənsən, bala, Qoşqar!* İ.Hüseynov.

**GÖTÜRÜMLÜLÜK** *is.* Səbirlilik, dözümlülük. *Götürümlülük yaxşı xasiyyətdir.*

**GÖVDƏ** *is.* 1. Bədən. *Rəis stola tərəf əyilmiş şişman gövdəsini geriyə əyib, kresloya söykəndi.* M.Hüseyn. *Bəy zıqqana-zıqqana ağır gövdəsini yerdən üzdü, dərhal yenə döşəkcəyə çırpdı.* Mir Cəlal.

2. Ağacın, ya kolun budaqlarını təpəsinə qədər saxlayan yerüstü hissəsi. *Ağacın gövdəsini ağartmaq. Tut ağacının gövdəsi. – Ovçu cəld özünü ağacların gövdələri arxasına verib daldalanmağa məcbur olurdu.* Ə.Məmmədxanlı. *..Qoçaq ağacın dövrəsinə hərlənib gövdəsinə yanaşdı.* M.Rzaquluzadə.

3. *tex.* Mexanizmin, maşının, cihazın və s.-nin əsas hissəsi, əsası; korpus. *Elektromotorun gövdəsi. – Maşının nəhəng gövdəsi hərlənməyə başladı.* Ə.Sadıq.

**GÖVDƏCİK** *is.* Balaca, kiçik gövdə; bədəncik.

**GÖVDƏLİ** *sif.* 1. İri, böyük, nəhəng; gövdəsi çox inkişaf etmiş. *Gövdəli palıd. – Hündür, gövdəli çinarların yarpaqları tozdan qabıq bağlamış və bozarmışdı.* M.İbrahimov. *Böyük bir maraqla de baxmısanmı; Sığınıb gövdəli şax budaqlara.* B.Vahabzadə.

2. *məc.* Kök, dolğun, yekə, iribədənli. *Gövdəli kişi. – Qaya kimi atın üzərinə tikilmiş*

*gövdəli adam isə cilovu daha da bərk çəkir, daxmaya .. baxdıqca baxırdı.* Mir Cəlal.

**GÖVDƏSİZ** *sif.* Bədəndən ayrılmış, bədənsiz. *O yanda qanlı gövdə; Bu yanda gövdəsiz baş.* Ə.Cavad.

**GÖVHƏR** *is.* [*fars.*] 1. Qiymətli daş, cavahir. *Yerə düşməklə gövhər qiymətdən düşməz.* (Ata. sözü). *Gövhər də çatlayıb üzülər tamam; Sərrafdan almasa düz qiymətini...* B.Vahabzadə. // *məc.* Parıldayan, işıq mənbəyi olan şeyə təşbeh. *Qara neftim, qara neftim; Bu yerin cövhərisən; Əzəl başdan ellərimin; Nur saçan gövhərisən.* M.Rahim.

**GÖVŞƏK** 1. B a x **gövşəyən** 1-ci mənada. *Gövşək heyvanlar.*

2. *is.* Heyvanlarda: ağız. [Dəvə] *çörəyi yerdən götürdü; Yavaş-yavaş gövşəyinə gətirdi.* Q.Zakir. ◻ **Gövşək çalmaq (vurmaq)** – b a x **gövşəmək**. *Qoyun gövşək vurur. – İnəklə öküz güney otundan yeyib yatır, şirin gövşək çalanda Ataşın da xəyalı öz atını çapırdı.* Ə.Vəliyev.

**GÖVŞƏMƏ** "Gövşəmək"dən *f.is.* [Qoca:] *O yanda malın gövşəməsi, ilxının oxrantısı qulağıma gəlmir.* A.Divanbəyoğlu.

**GÖVŞƏMƏK** *f.* Yemi mədədən qaytararaq yenidən ağızda çeynəmək (gövşəyən heyvanlar haqqında). *Orada-burada xoruz banlayır, inəklər, öküzlər gövşəyirdi.* S.Rəhman. *Dəvələr ahəstə-ahəstə gövşəyirdilər.* İ.Əfəndiyev.

**GÖVŞƏN** b a x **gövşək**. ◻ **Gövşən çalmaq** – gövşəmək. *Hava sakit, kənd səssiz olanda qoyunların öskürtüsü, inəklərin gövşən çalması eşidilirdi.* Ə.Vəliyev.

**GÖVŞƏŞMƏ** "Gövşəşmək"dən *f.is.*

**GÖVŞƏŞMƏK** *qarş.* Gövşəmək, gövşək çalmaq, gövşək gətirmək (çox heyvanlar haqqında). *Öküzlər gövşəşir.*

**GÖVŞƏYƏN** *sif. zool.* 1. Yemi gövşəməklə ikinci mədədə həzm edən. *Gövşəyən heyvanlar.*

2. Cəm şəklində: **gövşəyənlər** – yemi bu cür həzm edən dırnaqlı heyvanlar yarımdəstəsi.

**GÖY**[1] *is.* 1. Yer üzünün üzərində mavi bir qübbə kimi görünən fəza, boşluq. *Göydə buludlar üzür. Göydə ulduzlar sayrışır. Bu vaxt göydə bulud göründü.* // Yer üzünü əhatə edən kainat boşluğu; ənginlik, hava. *Bu halda sərayi-şahibən göyə bir fişəng buraxdılar.* M.F.Axundzadə. ◻ **Göy cisimləri** – Günəş, Ay, planetlər və ulduzlar. // Obrazlı ifadələrdə məcazi mənada. *Xəbər allam: göyün qapısı hardan; Kim açar, kim örtər, sorağı nədi?* "Abbas və Gülgəz". *Ömrünün min dürlü cilvəsi vardır; Könlümün göyləri damar-damardır.* M.Müşfiq. **Göy guruldamaq** – göydə göy gurultusu baş vermək. *..Bayırda şiddətlə göy guruldadı, şimşək parladı.* İ.Əfəndiyev. **Göy gurultusu (gurlaması)** – göydə şimşək çaxdıqdan sonra eşidilən bərk gurultu. *Bu sırada hava tutulur. Ara-sıra göy gurlaması davam edir.* H.Cavid. *Göy gurultusu .. qulaqbatıran bir dəhşətlə şaqqıldayırdı.* M.Hüseyn. **Göy qaralmaq** – hava bulud çəkdiyindən və ya axşam düşdüyündən qaranlıq olmaq. *Günəş batdı, göylər qaraldı.* M.İbrahimov. *Süzülən nurunu toplayıb qəmər; Girdi buludlara, qaraldı göylər.* M.Rahim. *Bir saat çəkmədi ki, çovğun şiddətləndi, üfüq tutuldu, göy qaraldı.* Mir Cəlal. **Göy qurşağı** – havadakı su damlacıqlarında işığın sınması nəticəsində görünən optik hadisə; hacılar yolu, qarı nənə örkəni. *Yağlanmış su dalğalandıqca göy qurşağı kimi rəng verib rəng alırdı.* M.Hüseyn. *Gözlərə tağ çəkən göy qurşağını; Hələ Kərbəlada görən olmayıb.* R.Rza. **Göy qübbəsi** – göyün görünən hissəsi. *Göy qübbəsindən asıldı qəndil; Üzündən alıb niqabı məndil.* Xətayi. *Axşamüstü tamamilə yerin üzərinə enmiş göy qübbəsi indi yenidən nəhəng bir çətir kimi açılıb yüksəlmiş, ən uzaq ulduzları ilə ta ərşə dirənmişdi.* Ə.Məmmədxanlı. *Keçdi kiçik bir zaman; Lap göyün qübbəsindən; Qırmızı bir xal düşdü.* Z.Xəlil.

2. Allahın, mələklərin, hurilərin və s. olduğu yer. *Göyün yeddinci qatı. – Göydə mələk, yerdə insan gözəli; Sənsən, xoş xuyinə qurban olduğum.* M.P.Vaqif.

◊ **Göydə axtarmaq** – çox axtarmaq, cidd-cəhd edərək əldə etməyə çalışmaq. [Qadın Aslana:] *Mənim kişim sənin kimiləri göydə axtarır.* S.Vəliyev. **Göydə almaq (götürmək, qapmaq)** – 1) tez götürmək, əlüstü almaq, macal vermədən qapmaq. *Yaxşı gündə mənəm-mənəm deyənlər; Ovu göydə alıb, göydə yeyənlər.* Q.Zakir; 2) tez satıl-

maq, rəvac olmaq. [Hacı Qara:] *Buların qumaşı özgə qumaşdır, müştəri macal vermir, göydə götürür!* M.F.Axundzadə. [Rüstəm] *bilirdi ki, Muğanın qarpızı Bakı bazarına çıxanda alıcılar bir-birinə dəyir, göydə qapırlar.* M.İbrahimov. **Göydə ələ düşmək** – çətin tapılmaq, həmişə ələ düşməmək. *Belə qazanc göydə ələ düşməz! – Əhməd həmişəki kimi burada da öz sevdiyi şüarını təkrar edib, icrasına qədəm qoydu.* B.Talıblı. **Göydə razı olmaq** – etiraz etmədən, dərhal razı olmaq, məmnuniyyətlə qəbul etmək. [Baloğlan:] *Bəli ya, təki* [Molla Sübhanın] *məvacibi gəlsin, göydə razı olar.* C.Cabbarlı. **Göydən düşmək** – təsadüfi olaraq ortaya çıxan, əldə edilən şey haqqında. [Musa:] *Bundan heç zad çıxmaz. Çünki sən bir nemətsən ki, göydən düşübsən Məcnun bəyin əlinə.* Ə.Haqverdiyev. **Göydən od yağdırmaq (ələmək, tökmək)** – dözülməz dərəcədə qızdırmaq, yandırmaq. *Günəş göydən od tökürdü. – Günəş göyün bir qatından od yağdırırdı.* M.Hüseyn. *Qışın şaxtasında, boranında, yayın göydən od ələyən uzun günlərində bu qızlar kətməni, beli əllərindən buraxmadılar.* Ə.Əbülhəsən. **Göydən od yağmaq** – çox isti olmaq, dözülməz dərəcədə qızmaq (hava haqqında). [Süleyman:] *Birdən evin divarları titrəşdi, hamı hövlnak yerlərindən qalxdılar, mən çıxdım eşiyə, gördüm göydən od yağır, yerdən alov çıxır..* Ə.Haqverdiyev. **Göyə çəkilmək** – 1) hündürdə uçmaq, cövlan etmək. *Şahinlər göyə çəkilir; Durnalar gölə tökülür.* "Əsli və Kərəm"; 2) tapılmamaq, qıt olmaq, ələ düşməmək. *Bir tərəf üsyandır, bir tərəf ordu; Göyə çəkilmişdir bu yerdə çörək.* S.Vurğun. **Göyə (göylərə) çıxartmaq** – həddən artıq tərifləmək, tərifdə ifrata varmaq, şişirtmək. *Məclisdəkilər eşşəyin tərifini göyə çıxarırlar.* "M.N.lətif." **Göyə (göylərə) çıxmaq** – 1) bərkdən eşidilmək, ucalmaq (bərk səs haqqında). *Zarıltısı* (*fəryadı*) *göyə çıxır. – Yazıq heyvanın zingiltisi göyə çıxırdı.* "Məktəb"; 2) gizlənmək. *Göyə çıxsan da, səni tapacağam;* 3) çox çalışmaq, əlləşmək, zəhmət çəkmək. *Ev tikmək üçün göyə çıxdı.* **Göyə qaldırmaq** – 1) yuxarı qaldırmaq, ucaltmaq. *At qabaq əllərini qaldırdı göyə və az qaldı noxtanı Kərbəlayı Qasımın əlindən qoparsın.* C.Məmmədquluzadə; 2) b a x **göyə çıxartmaq**. [Sədəf:] *Oğlunuz dissertasiyasında bizə balta çalır. Professor Vahidovun əkin sxemini göyə qaldırır.* Ə.Məmmədxanlı. **Göyə qalxmaq** – b a x **göyə çıxmaq** 1-ci mənada. *Teymurun anqırtısı göyə qalxır.* "M.N.lətif." **Göyə (göylərə) səs (səda) salmaq** – b a x **göyə çıxmaq** 1-ci mənada. *..Məzlum anaların fəryadı göylərə səda salmışdı.* S.S.Axundov. **Göyə sovrulmaq** – puç olmaq, heçə çıxmaq, heç bir nəticə hasil olmamaq. *Ümidi göyə sovruldu. – Sənin atəşinə yanıb kül olur; Əməllər, arzular göyə sovrulur.* B.Vahabzadə. [Şahmar:] *Mənim arzularım, gör necə puç oldu, kül kimi göyə sovruldu!* B.Bayramov. **Göyə ucalmaq** – 1) b a x **göyə (göylərə) çıxmaq**. *Gəlib dolandı günlər; Nə anamdan bir xəbər; Nə karvandan iz qaldı; Ahım göyə ucaldı...* S.Vurğun; 2) çox yuxarılara qalxmaq, yüksəlmək. *Çoxmərtəbəli evlər göyə ucalır. – Dürrə, şəhərin böyük məscidi və göylərə ucalan minarələrinin yanındakı kiçik bir daxmaya yetişdi.* S.Vəliyev. **Göyün yeddi qatı (mərtəbəsi)** – çox yüksək, çox hündür. *Tamaşaçılar salonda onu atıb-tutanda, elə bil, məni göyün yeddi qatına qaldırırdılar.* B.Bayramov.

**GÖY²** *sif.* 1. Səma rəngi; mavi. *Göy rəng.* // Bu rəngdə olan. *Göy parça. – Məhərrəmliyin dördüncü günü göy çarıqlı .. nabələd bir axund Naxçıvan şəhərinin Bazar küçəsində gəzirdi.* Qantəmir.

2. Zərbə, bərk bir şeyə toxunma və s. nəticəsində bədənin hər hansı bir yerində əmələ gələn ləkə; qançır. *Qolunda göy var.*

**GÖY³** 1. *sif.* Yaşıl. *Göy meşə. Göy çəmən. Göy göyərçin. – Seyrə çıxar uşaqlar; Göy çəməndə oynaşar.* A.Səhhət. [Dərviş:] *..Göy ot döşəyim, qara daş yastığım, enli yarpaqlar yorğanım idi!* A.Divanbəyoğlu. *Budur Azərbaycan – Şirvan, Qarabağ; Vətənin sevdalı göy yaylaqları.* M.Rahim.

2. *sif.* Yetişməmiş, dəyməmiş, kal. *Göy nar. Göy alça. –* [Bahar vaxtı] *yetişməyə başlayan meyvələrə gəldikdə biz onların dəyməyini gözləməzdik. Göy* (z.) *olmağına baxmayaraq .. yeyərdik.* S.S.Axundov. *Günəş*

*işığında .. yetişməmiş göy meyvələr görünürdü.* İ.Əfəndiyev.

3. B a x **göyərti**. *Üç dəstə göy. Göy qutabı.*

**GÖY⁴** *sif. dan.* Simic, xəsis. *Göy adam. – Yüz il əlində çıraq axtarsa Polad kimi göyü tapılmaz.* A.Şaiq. *Evin kişisi nə qədər rəhmdil idisə, arvadı bir o qədər qılıqsız və göy idi.* Ə.Vəliyev.

**GÖY⁵** *is*. Kürəkən, ata üçün qızın əri.

**GÖYCƏÇİÇƏK** *is. bot.* Lələkvari yarpaqları və göy çiçəkləri olan çoxillik ot bitkisi.

**GÖYCƏQARĞA** *is. zool.* Alaqarğadan kiçik oxuyan quş. *Sarı bülbüllər, torağaylar, göycəqarğalar, .. ənlikli bülbüllər hərəsi bir cür səslə oxuyub səs-səsə verirlər.* E.Sultanov.

**GÖYÇƏK** *sif.* Gözəl, qəşəng. *Göyçək qız. Göyçək gəlin. – Şah cavan və göyçək oğlan idi.* M.F.Axundzadə. [Asya:] *Batmış nə göyçək oğlandır.* Ü.Hacıbəyov. *Nərminə göyçək idi. Qaraxallı, girdə çəhrayı sifətindən təbəssüm əskik olmazdı.* B.Bayramov. // İs. mənasında. *Göyçəkləri xoş-kəlam, həm aşiqə ram; Vacibdi bizə duası Gürcüstanın.* S.Ə.Şirvani. *Dağlar çiçəyi yenə; Baxdı öz göyçəyinə.* R.Rza. // Xoşagələn, gözəl. *Demə Vaqif ki, filan kimsənə çox zirəkdir; Ya filan şeir deyir, yazısı həm göyçəkdir.* M.P.Vaqif. [Heydər bəy:] *Əsgər bəy deyir ki, həm ucuzdur və həm göyçəkdir, həm də rəngi solmur.* M.F.Axundzadə. *Köynəyi al ipək lalə; Zərif, qəşəng, göyçək lalə.* M.Rahim. // Zərf mənasında. *Nə göyçək yaraşır, nə xoş görünür; Mina, incə kəmər bel arasında.* Q.Zakir. *Ay nazənin, ay qabağın altından; Nə göyçək çəkilib qara qaşların.* Aşıq Ələsgər.

**GÖYÇƏKCƏ** *sif.* Çox göyçək, çox qəşəng, olduqca gözəl. *Göyçəkcə bir uşaq.*

**GÖYÇƏKLƏNDİRMƏ** "Göyçəkləndirmək"dən *f.is.*

**GÖYÇƏKLƏNDİRMƏK** b a x **göyçəkləşdirmək**.

**GÖYÇƏKLƏNMƏ** "Göyçəklənmək"dən *f.is.*

**GÖYÇƏKLƏNMƏK** 1. *f.* Göyçək olmaq, gözəl olmaq; gözəlləşmək.

2. *qayıd.* Özünə gözəllik vermək.

**GÖYÇƏKLƏŞDİRİLMƏ** "Göyçəkləşdirilmək"dən *f.is.*

**GÖYÇƏKLƏŞDİRİLMƏK** *məch.* Göyçək edilmək, gözəlləşdirilmək, qəşəngləşdirilmək.

**GÖYÇƏKLƏŞDİRMƏ** "Göyçəkləşdirmək"dən *f.is.*

**GÖYÇƏKLƏŞDİRMƏK** *f.* Qəşəngləşdirmək, gözəlləşdirmək. [Nazlı:] *Yaxşı deyirlərmiş ki, xoş gün adamı göyçəkləşdirər.* Ə.Əbülhəsən. // Göyçək göstərmək.

**GÖYÇƏKLƏŞMƏ** "Göyçəkləşmək"dən *f.is.*

**GÖYÇƏKLƏŞMƏK** *f.* Göyçək olmaq, qəşəngləşmək, gözəlləşmək.

**GÖYÇƏKLİK** *is.* Göyçək şeyin halı; qəşənglik, gözəllik.

**GÖY-DƏMİR** *sif.* Tünd kül rəngində olan, dərisi göy və üstündə ağ xalları olan (at haqqında). *Göy-dəmir madyan.*

**GÖYDƏNDÜŞMƏ, GÖYDƏNDÜŞMÜŞ** *f.sif.* Təsadüfi, gözlənilməz, təsadüfən ələ düşmüş. [Soltan bəy:] *Arvad əlimə göydəndüşmüş kimi olmuşdu.* Ü.Hacıbəyov. *Nanə Hünərin bu göydəndüşmə sualına cavab verməkdə çətinlik çəkdi.* Mir Cəlal.

**GÖYƏM** *is. bot.* Cır və peyvənd cinsləri, göy rəngli, turşməzə, ağızbüzüşdürücü meyvəsi olan kol-ağac. *Göyəm ağacı. //* Həmin meyvənin kolu, ağacı. *Göyəm .. çox budaqlanan koldur və ya 3-4 metr hündürlükdə ağacdır.* H.Qədirov. // Bu meyvədən bişirilmiş, hazırlanmış. *Göyəm mürəbbəsi. Göyəm kompotu.*

**GÖYƏMİ** *sif.* Göyəm rəngində, göy, tünd mavi. *..Allahqulunun göyəmi qanovuzdan tikdirib geydiyi təzə köynəyi altdan görünürdü.* Ə.Əbülhəsən.

**GÖYƏMLİK** *is.* Çoxlu göyəm ağacı bitən yer, göyəm kolluğu.

**GÖYƏRÇİN** *is* 1. İri çinədanlı, göy-boz rəngli quş, əhliləşdirilmişləri çox vaxt ağ rəngdə olur. *Məscidin damındakı göyərçinlər kəsik-kəsik uğuldayırdılar.* M.Hüseyn. *Kolun altından bir dəstə göyərçin pırıldayıb qalxdı.* Ə.Vəliyev.

2. *məc.* Nəvaziş, oxşama, əzizləmə məqamında işlədilir (bəzən "göyərçinim" şəklində). *Göyərçin qızım. – Bil ki, cəhənnəmin hər əziyyəti; Səndən uzaq olar... göyərçin balam!* S.Vurğun. *Ovçu, Pərini qolları ara-*

*sına alaraq*: – *Qorxma, göyərçinim, – dedi, – qorxma, göy guruldadı.* Ə.Məmmədxanlı.

◊ **Sülh göyərçini** – sülh simvolu kimi qəbul olunmuş ağ göyərçin şəkli.

**GÖYƏRÇİNİ** *sif.* Göy rəngə çalan, tündkülrəngi olan. *Göyərçini ləkə.*

**GÖYƏRDİLMƏ¹** "Göyərdilmək¹"dən *f.is.*

**GÖYƏRDİLMƏ²** "Göyərdilmək²"dən *f.is.*

**GÖYƏRDİLMƏ³** "Göyərdilmək³"dən *f.is.*

**GÖYƏRDİLMƏK¹** *məch.* Göy edilmək, göy rəngə boyadılmaq.

**GÖYƏRDİLMƏK²** *məch.* Əkilib yetişdirilmək.

**GÖYƏRDİLMƏK³** *məch.* Yaşıl rəngə boyadılmaq, yaşıl edilmək.

**GÖYƏRMƏ¹** "Göyərmək¹"dən *f.is.*

**GÖYƏRMƏ²** "Göyərmək²"dən *f.is.*

**GÖYƏRMƏ³** "Göyərmək³"dən *f.is.*

**GÖYƏRMƏK¹** *f.* 1. Göy rəng almaq, göy olmaq, göyləşmək, maviləşmək.

2. Zərbə və ya bərk şeyə toxunma nəticəsində bədənin bir yeri göy olmaq. *Qolu göyərdi. – Qızın üzü-gözü, .. zərif dodaqları şişmiş, bir yerdən hətta göyərmişdi.* H.Seyidbəyli.

3. *məc.* Soyuqdan, hirsdən, qeyzdən göy olmaq, göy rəng almaq. *Lalənin dodağı gömgöy göyərib; Üzü gah ağ olur, gah qıpqırmızı.* R.Rza. *Ədhəmin qara sifəti dərhal dönüb göyərdi.* B.Bayramov. // *məc.* Bərk hirslənmək, özündən çıxmaq. *Görüb o quşları göyərdi Osman; Turutun düzündə olduğu zaman.* H.K.Sanılı.

4. Uzaqdan görünmək (göy şey haqqında). *Uzaqdan dəniz göyərirdi.*

**GÖYƏRMƏK²** *f.* 1. Bitmək, göyərməyə başlamaq, cücərmək. *Arpa göyərdi. – Sünbül göyərir səbzə kimi güllərə qarşı.* Q.Təbrizi. *Dağlar, çöllər düşərdi; Novruzgülü göyərdi.* A.Səhhət.

2. *məc.* Baş vermək, nəşət etmək, əmələ gəlmək, səbəb olmaq. *Fitnə göyərir torpağımızdan, daşımızdan; Tarac edərək bac alarız qardaşımızdan.* M.Ə.Sabir.

3. *məc.* Bir nəticə vermək, nəticə hasil olmaq. [Bəy:] *Ürəyimdən keçənlər bir-bir göyərir.* Mir Cəlal. *Sədr vaxtilə dediyi sözlərin göyərdiyini görüb boğazını arıtladı.* B.Bayramov.

**GÖYƏRMƏK³** *f.* Yaşıllaşmağa başlamaq, yaşıllaşmaq. *Bağlar göyərib. Çəmən göyərdi. – Bahar yaşıllaşdı, dağlar, səhralar yuxudan ayılıb göyərməyə başladı..* Çəmənzəminli.

**GÖYƏRMİŞ¹** *f.sif.* Göy rəng almış, bozarmış. *Soyuqdan göyərmiş əllər. Zərbədən göyərmiş qol. – Xəlil soyuqdan göyərmiş əllərini bir-birinə sürtdü.* İ.Məlikzadə.

**GÖYƏRMİŞ²** *f.sif.* Yaşıllaşmış, bitmiş, cücərmiş. *Göyərmiş çöllər.* – [Cavad:] *Oyanıb çiçəklənmiş ağaclara, göyərmiş otlara baxıb deyirdim: nə olardı insan da .. bahar vaxtı bədənində təzə bir qüvvət olaraq oyana idi!* Ə.Haqverdiyev.

**GÖYƏRTƏ** *is.* [əsli *ital.*] Gəmi gövdəsinin üst hissəsindəki açıq sahə. *Göyərtəyə çıxmaq. Göyərtədə gəzinmək. Yükləri göyərtəyə yığmaq. – ..Göyərtədə sıxlaşmış sərnişinlərin rəngbərəng yaylıqları titrəşirdi.* M.Hüseyn. *Xəlil Mirzə gəminin nəm çəkmiş göyərtəsində yelkən dirəyinə söykənib oturmuşdur.* Q.İlkin.

**GÖYƏRTİ¹** *is.* 1. Ümumiyyətlə bitkilər (ot, ağaclar, yarpaqlar). *Hansı şeydir dəyişməyib dünyada; Göyərti də, heyvanat da, hava da.* A.Səhhət. *..Kəndin ətrafında, qapılarda, həyətlərdə göyərti əkmək, park salmaq, kölgəlik düzəltmək lazımdır.* Ə.Vəliyev.

2. Yeyilən və xörəyə işlənən otlar; göy, səbzəvat. *Göyərti qutabı. 5 dəstə göyərti.* – [Heydərqulu:] *Piri baba, xanım nənə mənə göyərti tapşırmışdır.* S.S.Axundov.

**GÖYƏRTİ²** b a x **göy²** 2-ci mənada. [Əntiqənin] *sağ üzünə vurulan şapalaq gözünün altına dəyir və iri bir göyərti əmələ gətirir.* Mir Cəlal.

**GÖYƏRTİÇİ** *is.* Göyərti əkib-becərmək və satmaqla məşğul olan adam.

**GÖYƏRTİÇİLİK** *is.* Göyərtiçinin işi, peşəsi, məşğuliyyəti.

**GÖYƏRTİLİ** *sif.* 1. Göyərti əkilmiş, göyərtisi, yaşıllığı olan; göy. *Göyərtili həyət.*

2. Tərkibində göyərti olan, göyərti qatılmış. *Göyərtili sıyıq.*

**GÖYƏRTİLİK** *is.* Göyərti əkilmiş yer, göyərti bitən yer. *Hər kəs həyətdəki göyərtiliyi sulamaq istəyirdi.* S.Rəhimov.

**GÖYƏRTİSATAN** *is.* və *sif.* Göyərti satmaqla məşğul olan; göyərtiçi.

**GÖYƏRTİSİZ** *sif.* Göyərti bitməyən, göyərtisi olmayan. *Göyərtisiz sahə.*

**GÖYƏRTMƏ¹** "Göyərtmək¹"dən *f.is.*

**GÖYƏRTMƏ²** "Göyərtmək²"dən *f.is.*

**GÖYƏRTMƏK¹** *f.* Göy rəngə boyamaq; mavilәşdirmәk. *Paltarı boyayıb göyərtmək.*

2. Bərk bir şeylə vurub, yaxud toxundurub, göyərmək, qançır əmələ gətirmək. *Bədənini göyərtmək. Gözünün altını göyərtmək.*

**GÖYƏRTMƏK²** *f.* Göyərməsinə, bitməsinə səbəb olmaq, kömək etmək. *Yazın istisi buğdanı göyərtdi.* // Əkmək, becərmək, yetişdirmək. *Ağacı göyərtmək. – Lakin o adam daha böyük ləzzət alır ki, .. zəmilər göyərdir, bağlar salır..* M.İbrahimov.

**GÖY-GÖYƏRTİ** *top.* b a x **göyərti¹**. *Göy-göyərti əkmək. Göy-göyərti almaq. – Həyətlərdə ağac-uğac, göy-göyərti nadir, içməyə su da yoxdur.* M.Rzaquluzadə. *Firəngiz göy-göyərti ilə toyuq ətini iştaha ilə yedi.* B.Bayramov.

**GÖL-GÖYƏRTİLİK** b a x **göyərtilik**. [Şiraslan düşünürdü:] *..Bu qaynar çeşmələr .. yollar üzərinə gətirilərsə, onlar göy-göyərtilik içərisindən ağara-ağara axar*(*dı*)... S.Rəhimov.

**GÖYGÖZ** *sif.* 1. Gözləri göy; gözügöy. *Göygöz qız. – Yusif kürən, göygöz, yekəbaş uşaqlardan birinə baxan kimi onun Şirin nəslindən olduğunu yəqin etdi.* B.Bayramov.

2. *məc.* Çox simic, xəsis (adam). *Göygözün biridir.*

**GÖYGÖZLÜ** b a x **göygöz** 1-ci mənada. *Laçının məktəb yoldaşı arıq, uzun, alnıçapıq, göygözlü bir oğlandı.* M.Hüseyn.

**GÖYGÖZLÜK** *is.* 1. Gözlərin göy olması.

2. *məc.* Simiclik, xəsislik. *Göygözlük etmək.*

**GÖYLƏŞMƏ¹** "Göyləşmək¹"dən *f.is.*

**GÖYLƏŞMƏ²** "Göyləşmək²"dən *f.is.*

**GÖYLƏŞMƏK¹** *f.* Göy rəng almaq; mavilәşmәk. *Paltar boyanıb göyləşdi.*

**GÖYLƏŞMƏK²** *f.* Göyərib, qol-budaq atıb göy olmaq; yaşıllaşmaq.

**GÖYLÜ** b a x **göyərtili** 1-ci mənada.

**GÖYLÜK¹** *is.* Göy rəngdə olma; mavilik. *Paltarın göylüyü. – Göylüyünü necə saxlar bu göylük; Durnaları dönməz oldu dağların..* M.Araz.

**GÖYLÜK²** *is.* 1. B a x **göyərtilik**. *Göylüyü sulamaq.*

2. Otlaq, otluq, yaşıllıq. *Sürünü göylüyə buraxmaq. – Bəzəsin çölləri başdan-başa göylük, otluq; Ta əzəldən bizə yaddır qıtlıq.* S.Rüstəm. *Örüşdən dönən heyvanlar göylükdən ayrılıb yola çıxır.* İ.Hüseynov. // Bağbağat, yaşıllıq. *Evlər itsin içində; Yaşıllığın, göylüyün.* M.Rahim.

**GÖYNƏDƏN, GÖYNƏDİCİ** *sif.* Göynətmək xüsusiyyəti olan; acışdırıcı, qıcıqlandırıcı, qaşındırıcı. *Xəlil .. ürəyini göynədən sözləri əmisi oğlundan soruşa bilmədi.* İ.Məlikzadə.

**GÖYNƏDİCİLİK** *is.* Göynətmək xüsusiyyəti olma; acışdırıcılıq, qıcıqlandırıcılıq, qaşındırıcılıq.

**GÖYNƏMƏK** *f.* 1. Qıcıqlanmaq, qaşınmaq. *Onun üzü-gözü qırışır və elə bil boğazı da göynəməyə başlayırdı.* Ə.Əbülhəsən. *Əvvəla, kətmən dəyən yer bərk göynəyirdi. İkincisi, qolları az qalırdı ki, qırıla.* Ə.Vəliyev.

2. Ağrımaq, sızıldamaq, gizildəmək. *Şad idi, vücudim oynar idi; Can həsrət odunda göynər idi.* Xətayi. *Zirzəmi yaman rütubətdir ha... Hələ heç bir saat da keçməyib, amma indidən qıçlarım göynəyir.* M.Hüseyn. *Lakin deyin, söyləyin, hansı təbib bağlayar; Ruhun gözəgörünməz, göynəyən* (f.sif.) *yarasını?* R.Rza.

3. *məc.* Yazıq-yazıq, yavaşdan ağlamaq, sızlamaq, inləmək. *Uşaq göynəyirdi.*

4. *məc.* Bir şeyin üstündə əsmək. [Əşrəf:] *Başqasının ürəyinə çalın-çarpaz dağ çəkə bilirsən, özünə isə bir balaca toxunanda göynəyirsən. Bu insafdırmı?* İ.Şıxlı.

**GÖYNƏRTİ** *is.* Göynəmə, sızıldama, ağrıma. *Şeydanın sinəsinin altındakı köhnə çapığın göynərtisi dərhal əriyib yoxa çıxdı.* B.Bayramov.

**GÖYNƏTMƏ** "Göynətmək"dən *f.is.*

**GÖYNƏTMƏK** *icb.* 1. Qıcıqlandırmaq, acışdırmaq, qaşındırmaq. *Dərman yaranı göynətdi.* – [Nəcəfalı] *qozdan bir neçəsini qoynuna doldurdu, qərzəkli qoz ətini göynətdi.* B.Bayramov.

2. *məc.* Narahat etmək, nigarançılıq doğurmaq, incitmək, ruhi əzab vermək. *İndi* [Tahirin] *fikrini ana həsrəti göynədirdi.*

M.Hüseyn. *Hamını göynədən* (f.sif.) *hələ taxıl vergisi idi.* Mir Cəlal.

**GÖYÖSKÜRƏK** *is. tib.* Adətən uşaqların tutulduğu sürəkli üzücü öskürək şəklində təzahür edən yoluxucu xəstəlik.

**GÖYRÜŞ** *is. bot.* Lələkvari yarpaqlı, qanadlı meyvəsi olan, ağır və möhkəm oduncaqlı ağac; vən. *Göyrüş və ya vən ucaboylu, qışda yarpağı tökülən ağacdır.* H.Qədirov.

**GÖYRÜŞLÜK** *is.* Çoxlu göyrüş ağacı olan yer. *Göyrüşlükdə dincəlmək.*

**GÖYSATAN** b a x **göyərtisatan**.

**GÖYTÜRK** *is. tar.* Orta Asiyada yaşamış qədim bir türk ulusu və bu ulusdan olan kimsə. *Göytürk xaqanlığı.*

**GÖYTÜRKCƏ** *is.* Göytürk dili, Orxon türkcəsi.

**GÖYÜMSOV, GÖYÜMTRAQ, GÖYÜMTÜL** *sif.* Göy rəngə çalan. *Göyümtül göz. – Otağı göyümtül papiros tüstüsü bürüdüyündən adamların siması xəyal kimi dumanlı görünürdü.* M.Hüseyn. [Qaragünün] *..alnının sol tərəfində dərin göyümtül çapıq .. görünürdü.* M.Rzaquluzadə.

**GÖY-YAŞIL** *sif.* Göylə yaşıl arasında olan, həm göyə, həm də yaşıla çalan. *Göy-yaşıl parça.*

**GÖYZƏMİN** *sif.* Yerliyi (fonu) göy rəngdə olan. *Göyzəmin parça. – Gülşad göyzəmin krep-satindən, yaxası düyməli, qolu uzun don geymişdi.* Ə.Əbülhəsən.

**GÖZ** *is.* 1. İnsan və heyvanda görmə orqanı. *Qara gözlər. Ala gözlər. İri göz. – Xumar-xumar baxmaq göz qaydasıdır; Lalə tək qızarmaq üz qaydasıdır.* M.P.Vaqif. *Arvad .. yaşarmış gözlərini silib ərinin qabağında döyükə-döyükə qaldı.* S.Rəhman. ◻ **Göz ağı** *anat.* – gözün ağ rəngli qabarıq qeyri-şəffaf qişası. **Göz alması** *anat.* – gözün, göz ağı və göz qarasının da daxil olduğu şarşəkilli hissəsi. **Göz qapağı** – b a x **qapaq** 2-ci mənada. *Rzaqulu xan yalvardıqca Böyükxanım göz qapaqlarını bir-birinə çalıb hərdən bir qətrə göz yaşı atırdı.* M.S.Ordubadi. **Göz qarası (bəbəyi)** – b a x **bəbək** 1-ci mənada. **Göz yuvası** *anat.* – kəllənin üz hissəsində göz almasının yerləşdiyi batıq; göz çuxuru. // **Gözüm** şəklində – əzizləmə, nəvaziş, oxşama, mehribanlıqla müraciət. [Qurbani:] *Canım təbib, gözüm loğman; Mənim dərdim ara tez-tez.* "Qurbani".

2. Görmə qabiliyyəti, görmə. *İti göz. Gözü zəifləmək.*

3. **Gözümdə (gözündə)** şəklində – nəzərimdə (nəzərində), mənə görə (ona görə), mənim fikrimcə (onun fikrincə). *Mənim gözümdə o heç bir şeydir. Sənin gözündə o, böyük adamdır.*

4. Nəzarət, baxım. *Uşağın üstündə göz lazımdır.*

5. Xırda dəlik, deşik. *Aşsüzənin gözləri. İynənin gözü. – Gilli məhlul baltanın gözlərindən* (*dəliklərindən*) *çıxaraq .. quyunun ağzındakı nov sisteminə tökülür.* S.Quliyev.

6. Bulağın başladığı yer, suyun çıxdığı yer; qaynaq, mənbə. *Bulağın gözü tutulub. – Qaynar bulaqların gözündən içər; O ellər gözəli, o el yavrusu.* S.Vurğun.

7. Kiçik pəncərə (kassada, poçtda və s.-də). [Qulam müəllim] *şüşə gözün müqabilinə gəldi, vərəqəni uzatdı.* S.Rəhimov. // Keçmək üçün hasarda, divarda açılmış dəlik. *Hasardan qonşu bağa göz açmaq.* – [Tellinin] *müəllimlə öz otağının arasındakı divarda qapı kimi, fəqət alçaq, bir arşın hündürlüyündə bir göz vardı.* S.Hüseyn. *Üstləri dəmirli qalın qapılar; Ortada balaca göz yerləri var.* H.K.Sanılı.

8. Yaranın, şişin irin axan yeri. *Çibanın iki gözü vardır. Yaranın gözü açıldı.*

9. Hissələrə ayrılmış bir şeyin ayrı-ayrı bölmələri. *Portfelin kiçik gözü. Şkafın üst gözü. Xurcunun gözləri. – Heç bir söz demədən* [Rüstəm kişi] *başının üstündəki balaca dolabçanın gözünə qoyulmuş trubkanı götürüb* [Şərəfoğluya] *verdi və əlini sıxdı.* M.İbrahimov. *İşini tamam etdikdən sonra xarrat dolabın gözlərindəki kitablara nəzər at*(*dı*). T.Ş.Simurq. *Birinci iynəni batırarkən pəncərənin qırıq gözünə yamadığı kağız xəfif səs çıxardı.* H.Nəzərli.

10. Qoşa və ya üçlülə tüfəngin lülələrindən hər biri. *Tüfəngin iki gözünü də sıxdım, ancaq heç biri dəymədi.* M.Rzaquluzadə.

11. Tərəzi qablarından hər biri. *Hacı bir heyvərə daşı tərəzinin bir gözünə qoyub deyir..* Ə.Haqverdiyev.

12. Adətən saylara qoşularaq, evdə, mənzildə neçə otaq, ya pəncərə olduğunu göstərir. *Üç göz ev. İki göz pəncərə. – Binanın alt mərtəbəsi iki xırdaca gözdən, üstü isə yalnız bir gözdən ibarət idi.* S.Rəhimov.

13. *məc.* Alov mənasında. *Lampanın gözünü çəkmək. – Şeyx Haşimi kiçik mizə yaxınlaşıb, qəzəblə barmağını bir-bir şamların gözünə basır, şamlar sönür, çadır qaranlıq içində qalır.* Ə.Məmmədxanlı.

14. Körpünün bir özülündən o biri özülünə qədər olan hissəsi, bölməsi. *Körpünün üç gözü var.*

◊ **Göz aça bilməmək** – fürsət, vaxt tapa bilməmək. *İşin çoxluğundan göz aça bilmirəm.* **Göz (gözlərini) açan gündən (açandan)** – 1) lap körpəlikdən; 2) başa düşəndən bəri, dərk etdiyi vaxtdan. *Yerdə qalanları isə gözlərini açandan onu Güllücədə görmüşdülər.* S.S.Axundov. **Göz açıb yuman saatda** – bir an içində, tez, əlüstü, o saat. [Məstəli şah:] *Xanım, bir adam ki buradan Pariji göz açıb yuman saatda bərbad edə, onun xəbərin bir dəqiqədə, bir saatda, bir gündə, on günədək bura çatdıra bilməz?* M.F.Axundzadə. **Göz açıb yumunca** – bir anda, bir an içində. *Göz açıb yumunca işini qurtardı.* **Göz açmaq** – 1) dünyaya gəlmək, doğulmaq. *İnsanoğlu bu aləmə göz açdığı gündən bəri; Azadlığın məşəlinə qurban olmuş pərvanətək.* S.Vurğun; 2) macal tapmaq, imkan əldə etmək, vaxt tapmaq. *Göz açmağa macalım yoxdur.* **Göz açmamaq** – macalı, vaxtı, imkanı olmamaq. *Döyüşdən göz açmayan Rüstəm* [Şərəfi] *unuda bilmirdi.* M.İbrahimov. [Osman:] *Basırdı gülləni sola, həm sağa; Qoymurdu düşməni heç göz açmağa.* H.K.Sanılı. **Göz ağartmaq** – qorxuducu nəzərlə, hədələyici tərzdə baxmaq. *Niyaz anasına göz ağartdı, Ballı söhbəti kəsdi.* Ə.Vəliyev. **Göz ağartması vermək** – b a x **göz ağartmaq**. **Göz altından (altınca) baxmaq (süzmək)** – başqalarına sezdirmədən, gizlicə baxmaq (süzmək). *Hüseyn oynadıqca göz altından Surxaya baxırdı.* S.Rəhman. [Beyrək] .. *göz altından məclisdə olan gəlinləri, qızları süzməyə başladı.* M.Rzaquluzadə. **Göz atmaq** – gözlə işarə eləmək. *Göz atdım gözünə, himlədim bəri; Dayandı şir kimi pürvüqar gördüm.* S.Vurğun. **Göz bəbəyi** *məc.* – əziz və sevgili sayılan. *Onun göz bəbəyi bir oğlu var.* **Göz bəbəyi kimi qorumaq (saxlamaq)** – böyük diqqətlə qoruyub mühafizə etmək, qayğısını çəkmək. *Milli musiqi alətlərimizi göz bəbəyi kimi qorumalıyıq.* **Göz böyümək** – qorxu, dəhşət bürümək, vahimə basmaq. *Dərənin dibinə endikcə göz böyüyür, hər şey qaralır, şübhəli görünürdü.* Mir Cəlal. **Göz bulağı** – b a x **bulaq**. *Hicran dəryasında, göz bulağında; Qurbani, çalxanıb bircə üz indi.* "Qurbani". **Göz çəkmək (yığmaq)** – b a x **əl çəkmək** 3-cü mənada. [Pəri Əbdülə:] [Puldan] *göz çək.* C.Cabbarlı. **Göz çıxarmaq** – b a x **gözünü çıxartmaq** 2-ci mənada. **Göz dağı çəkmək** – dərdə salmaq, qüssə vermək, ağır zərbə vurmaq. *Oğlunu öldürüb anasına göz dağı çəkmək. – Bəlkə, neçə-neçələrə göz dağıyam, şöləyəm; fikri dustaq olanlara; dili yasaq olanlara!* R.Rza. **Göz dəymək** – mövhumata görə baxışından ziyan, zərər çəkmək. *Uşağa göz dəyib. – Al, yaşıl geyinib durma qarşıda; Yayın bəd nəzərdən, göz dəyər sana.* Qurbani. **Göz dəyməsin!** – gözdəymənin qarşısını almaq üçün işlədilən ifadə. *Dəyməsin göz, qəribə zirəksən; Bu fərasətdə dəhrdə təksən.* S.Ə.Şirvani. **Göz dikmək** – 1) bir şeyi ələ keçirmək arzusunda olmaq, sahib olmağa çalışmaq. [Əziz bəy:] *Nəkarədir ki, bir arşınölçən mənim adaxlıma göz dikə!* M.F.Axundzadə. *Yetim malına göz dikməyin nədir daim; Halal kəsb məgər narəvadır, ey vaiz?* S.Ə.Şirvani; 2) bel bağlamaq, ümid olmaq, arxayın olmaq. *Ata malına göz dikən malsız-davarsız qalar.* (Ata. sözü). *Bu gün bir süngüdür əlimdə qələm; Mənim bayrağıma göz dikir aləm.* S.Vurğun; 3) nəzər yetirmək, baxmaq. *Elə mən deyiləm hüsnünə mail; Göz dikibdir tamam Qarabağ sənə.* Q.Zakir. **Göz dolandırmaq** – ətrafına baxmaq. *Kərəm göz dolandırıb gördü ki, ovçular iki quzusu olan bir ceyranı vurublar.* "Əsli və Kərəm". **Göz dolusu** – fərəhlə, ürəklə, razı halda, şad. *Göz dolusu evini süzdü. – Səkinə göz dolusu ərinə baxıb gülümsədi.* M.İbrahimov. **Göz doymamaq** – b a x **gözü doymamaq**. *Göz doymaz vəsməli ka-*

*man əbrudən; Can üzülməz səmən iyli geysudən.* M.P.Vaqif. **Göz etmək (eləmək)** – gözlə işarə eləmək. **Göz gəzdirmək** – hər tərəfə baxmaq, başdan-ayağa süzmək, nəzər salmaq. *Otağa göz gəzdirmək. Məclisə göz gəzdirmək. – Telli həyətin hər tərəfinə göz gəzdirdi.* S.Hüseyn. [Rüstəm bəy] *ətrafa göz gəzdirərək sanki söz axtarırdı.* Çəmənzəminli. **Göz görə (görə-görə)** – açıq, aşkar, bəlli, gözlə görüldüyü halda. *Göz görə-görə oğurluq etmək. – Yalançının dili yandı göz görə-görə; İnanmadı dili alov yaxanlar belə.* M.Araz. **Göz götürmək (çəkmək)** – baxmamaq, əl çəkmək. *Ayrı düşüb ulusundan, elindən; Yenə göz götürməz xublar telindən.* Q.Zakir. **Göz götürüb baxmaq** – başını qaldırıb baxmaq, nəzər salmaq. [Səkinə] *göz götürüb qonaqlara baxa bilmirdi.* Ə.Abbasquliyev. **Göz gözə baxmaq** – üzbəüz oturmaq, bir-birinin üzünə, gözünə baxmaq. *Ələsgər də eşq oduna alışdı; Göz gözə baxanda halın soruşdu.* Aşıq Ələsgər. **Göz gözə gəlmək** – baxışları qarşılaşmaq, bir-birinə baxmaq. **Göz gözü görməmək** – çox qaranlıq, zülmət olmaq, heç bir şey seçilməmək. [Şahmar bəy:] *Yamanca qaranlıqdır, göz gözü görməyir.* N.Vəzirov. [Aqşin:] *İşıq ver, göz gözü görmür.* C.Cabbarlı. *Qaranlıqda göz gözü görmürdü.* S.Hüseyn. **Göz işlədikcə** – gözlə görülə bilən qədər, gözün görə bildiyi qədər (adətən çox geniş sahə haqqında). *Göz işlədikcə tarlalar uzanırdı. – Göz işlədikcə gülümsər yaşıl xiyabanlar; Yaşıldı pəncərə, balkon, yaşıldı meydanlar.* H.Cavid. **Göz kəsilmək** – bütün diqqətilə baxmaq. **Göz kəsməmək** – diqqətlə baxmaq, nəzərini çəkməmək, daim baxmaq. *Onun üçün göz kəsmərəm gözündən; Müştaqəm, ey şəkər kanı, mən sənə.* M.P.Vaqif. **Göz (gözü, gözləri) qabağına gətirmək** – xəyalında canlandırmaq, təsəvvürünə gətirmək, yada salmaq. *Keçmiş günlərini göz qabağına gətirdi. – Onu yüz dəfə gözümün qabağına gətirmişəm, yüz dəfə xatırlamışam, lakin heç kəsə heç nə söyləməmişəm.* İ.Əfəndiyev. **Göz qabağına qoymaq** – bir şeyi tez gözə dəyən, asanlıqla tapılan yerdə saxlamaq. *Kitabları göz qabağına qoymaq. – Pərşan bağçaya getdi, zanbaq güllərini bankaya salıb artırmaya, göz qabağına qoydu.* M.İbrahimov. **Göz qabağında (qarşısında)** – üzdə, ortada, meydanda. *Nöqsanlar göz qabağındadır. – Gələcək qəsəbənin küçələri də artıq göz qabağında idi. Nəticə göz qabağındadır.* **Göz qamaşdırmaq** – 1) gözlərini kütləşdirmək (parıltı). *Üzüyün qaşı göz qamaşdırır;* 2) *məc.* çox güclü təsir etmək. [Nadir bəy:] *..Sonra* [tarixi-müqəddəsdə] *yarpaqları çevirin! – Dini-siyasi minlərcə qanlı səhifələr gözlərinizi qamaşdırır.* H.Cavid; 3) heyran etmək. *Qızın gözəlliyi göz qamaşdırır. – Çayın vadisindəki çəmənlik də göz qamaşdırırdı.* İ.Şıxlı. **Göz-qaş (gözlə-qaş) arasında** – tez, bir anda. *Göz-qaş arasında yox oldu. – Könlüm quşu seyd oldu gözü-qaş arasında; Qanlar düşəcəkdir iki yoldaş arasında.* Q.Zakir. **Göz qıcırtmaq** – b a x **diş qıcamaq** (“**diş**”də). *..Xanın düşmənləri buraya göz qıcırdıblar.* M.S.Ordubadi. **Göz qırpımında** – b a x **göz açıb yumunca** (bəzən “bir” sözü ilə bərabər işlənir). *Göz qırpımında hər şeyi ayırd etmək. – Bir göz qırpımında düşmən tankı artıq ön atəş xəttini keçmiş, .. batalyonun komanda məntəqəsi yerləşən təpəyə doğru istiqamət almışdı.* Ə.Məmmədxanlı. **Göz qırpmaq** – 1) gözünü tez yumub açmaq; 2) *məc.* sayrışmaq, yanıb sönmək. *Bakı milyon gözlərlə göz qırpır, uzaqlarda işıqdan atəşli bir qövs cızır, qövsdən o tərəfdə isə qaranlıq hamar bir sahə uzanırdı.* Ə.Məmmədxanlı. *Hər iki yanda bir çağırımlıqda göz qırpan bir işıltı görünürdü.* M.Rzaquluzadə. **Göz qoymaq (yetirmək)** – 1) hiss etdirmədən diqqətlə baxmaq, fikir vermək, müşahidə etmək. *Mən ona göz qoymuşdum, o, artıq məni buraxmaq istəmirdi, hər yana gedirdimsə kölgəm kimi dalımca sürünürdü.* M.S.Ordubadi. *Uşaq bağçasından keçirdim dünən; Göz qoydum oynaşan körpələrə mən.* S.Vurğun. *Mən oğurluqca ona göz qoyurdum.* Mir Cəlal; 2) nəzarət etmək, baxmaq. [Lal Hüseyn] *çiyidin müntəzəm surətdə səpilməsinə göz yetirirdi.* M.İbrahimov. **Göz-qulaq olmaq** – ciddi nəzarət etmək, baxmaq. – *Uşaqdan göz-qulaq ol! – Göz qulaq ol! – əmrini verdikdən sonra ordugaha döndü.* H.Nəzərli. **Göz**

**oxşamaq** – ürəyə yatmaq, gözə xoş gəlmək, ürək açmaq. *Adamlar göz oxşayan sarı, qırmızı, bənövşəyi çiçək xiyabanı ətrafında dolaşırlar.* İ.Şıxlı. **Göz olmaq** – 1) pusmaq, güdmək, nəzarət etmək. *Dustağa göz olmaq.* – [Yusif:] *Hər ikisinə özüm göz olaram.* S.Rəhman; 2) muğayat olmaq, himayə etmək, göz qoymaq, nəzarət etmək. *Uşağa göz ol! – Göz ol balamıza, görüm onu mən; Həm özünə layiq, həm mənə layiq.* S.Rüstəm. **Göz önünə gətirmək** – yadına salmaq, xatirinə gətirmək, təsəvvüründə canlandırmaq, xatırlamaq. *..Keçdiyimiz yerlərdəki vəziyyəti göz önünə gətirib bunlara inanmalı oldum.* M.Rzaquluzadə. **Göz önünə qoymaq** – b a x **göz qabağına qoymaq**. **Göz salmaq** – b a x **gözü düşmək**. **Göz tutduqca** – b a x **göz işlədikcə...** *Yaxşısı budur ki, elə buradan baş alıb göz tutduqca diyarbədiyar qaçım.* E.Sultanov. **Göz ucu ilə (ucuyla) baxmaq** – ötəri baxmaq. [Durna:] *And içirəm o görünməz Tanrıya ki, heç bir zaman mənim* [Əsəd bəyə] *göz ucuyla baxdığım da olmamış*(*dır*). C.Cabbarlı. **Göz (gözüm) üstə!** – b a x **Baş üstə!** (“**baş**”da). *Baş üstə, göz üstə deyib, mən də ağanın qulluğuna təşrif apardım.* N.Vəzirov. *Əlini gözünün üstünə qoyub* “*gözüm üstə!*” *deyib getdi.* Ə.Haqverdiyev. [Mədən müdiri:] *Nə istəsən mənim bax bu gözüm üstə.* M.Hüseyn. **Göz üstə (üstündə) yerin(iz) var** – əziz, hörmətli adamı nəzakətlə dəvət məqamında söylənir. *Buyurun evimizə, göz üstə yeriniz vardır. – Asta qədəm qoyub, bir bizə gəlsən; Yerin var göz üstə, qız, qadan alım!* Aşıq Ələsgər. [Banıçiçək:] *Mənə qonaq gəlibsiniz, gözüm üstə yeriniz var.* M.Rzaquluzadə. **Göz verib işıq verməmək** – daim sıxışdırmaq, narahat etmək, incitmək, təzyiq altda saxlamaq. [Mərcan bəy:] *Pulun ola, malın ola, amma arvad sənə göz verib işıq verməyə.* Ü.Hacıbəyov. [Məsmə:] *Mən nə etməli idim. Bu adam mənə göz verəcək, işıq verməyəcəkdi.* S.Hüseyn. **Göz vurmaq (basmaq, etmək, çalmaq)** – işarə etmək üçün gözünün birini qırpmaq. *Rzaqulu göz elədi ki, dinməyim.* C.Məmmədquluzadə. *Hatəmxan yüzbaşıya tərəf göz çalaraq sağ əlinin baş barmağını heç kəs görmədən yanda tovladı və: – Yüzlük! – deyə, sözünü tez kəsdi.* S.Rəhimov. *Nərgizlə Gülşən bir-birinə göz vurdular.* Ə.Vəliyev. **Göz yaşı** – damla, qətrə halında gözdən axan su. *..Aşiqinə qanlar ağladan dilbər; Rəhmə gəlib göz yaşını silməzmi?* M.P.Vaqif. *Məzlumların göz yaşı dərya olacaqmış; Dəryaları, ümmanları neylərdin, ilahi?* M.Ə.Sabir. **Göz yaşı kimi (təki)** – saf, təmiz, dumduru. *..Dağlardan göz yaşı kimi duru, bal kimi şirin, hava qədər yüngül çeşmələr axır.* H.Nəzərli. *Söyüd ağacının yaxınlığında xırdaca bir qayadan göz yaşı kimi duru bir bulaq çıxıb ağacın dibi ilə axırdı.* M.Rzaquluzadə. **Göz yaşı tökmək (axıtmaq)** – ağlamaq. *Dərin sükuta dalmış uzun gecələri isə göz yaşı tökərək xəyal ilə keçirirdim.* S.S.Axundov. **Göz yetirmək** – baxmaq, nəzər salmaq, diqqət etmək, göz gəzdirmək. [Əsgər:] *Belə, sözün doğrusu, o tərəfə-bu tərəfə baxıb göz yetirirəm, görürəm yenə bir şeyim çatmır.* Ü.Hacıbəyov. **Göz yummaq** – 1) əhəmiyyət verməmək, fikir verməmək. [Muradın] *qarşısında iki yol vardı*: *Nigarı boşayıb adını öz üzərindən qaldırmaq və ya onu tamamilə sərbəst buraxıb hər işinə göz yummaq.* S.Hüseyn; 2) əl çəkmək, etinasız olmaq. *Bu işdən boyun qaçırmaq gələcək səadətə göz yummaq deməkdir.* Ə.Sadıq. **Göz yumub açınca (açana qədər)** – b a x **göz açıb yuman saatda**. *Göz yumub açınca seylabə verərdim aləmi.* Füzuli. **Gözdə-qulaqda olmaq** – b a x **göz-qulaq olmaq**. *..Özün isə gözdə-qulaqda ol. Elə ki Kərəmovun yaxası ələ keçdi, birinci zərbəni sən endir.* İ.Əfəndiyev. **Gözdə olmaq** – diqqət mərkəzində olmaq, hamının diqqətini cəlb etmək. *Gülşənin manqası niyə gözdədir?* Ə.Vəliyev. **Gözdən buraxmaq (qaçırmaq)** – görməmək, diqqətli olmamaq. [Münəccim pişxidmətə:] *Südabəni gördün sən; Səyavuşu öpərkən? Gözdən qaçırma, diqqət!* H.Cavid. **Gözdən çəkilməmək** – daim ortada gəzmək, göz qabağında olmaq. *Nə edəsən ki, Mələknisə də gözdən çəkilmirdi ki, çəkilmirdi.* Mir Cəlal. **Gözdən düşmək** – əvvəlki hörmətini itirmək, etibardan düşmək, daha sayılmamaq. *Başqa məhparələr eşqində gözümdən düşdü; Qətrə gözdən dü-*

*şər, əlbəttə ki, dəryayə görə.* Ə.Vahid. **Gözdən eləmək** – gözünü şikəst etmək, kor etmək, işığa həsrət qoymaq. *Çox ağlamaq ananı gözdən elədi. – Səni gözdən eləyən; Gözdən iraqlaşdıran; Bu uğursuz çadranı; Fırlat qaranlıqlara!* Ə.Cavad. **Gözdən iti** – görmə qabiliyyəti yaxşı olan, itigözlü. **Gözdən itmək** – görünməz olmaq, görünməmək, yox olmaq, tez çıxıb getmək. *Novruzəli bu sözləri deyəndən sonra gözdən itdi.* C.Məmmədquluzadə. *Yolun ortasında özünü günə verən koramallar səs eşitdikdə sürünüb qalınlıqda gözdən itirdilər.* İ.Şıxlı. **Gözdən keçirmək** – 1) ötəri baxmaq, nəzər salmaq. *Qulam müəllim hər iki yazını gözdən keçirdi.* S.Rəhimov. *Mirbalayev vərəqəni alıb .. gözdən keçirdi.* M.Hüseyn. *Məhərrəm kağızları bir-bir gözdən keçirməyə başladı.* H.Nəzərli; 2) baxmaq, nəzər atmaq, fikir vermək. *Sinfi gözdən keçirmək. Ətrafı gözdən keçirmək. – Yolçu bir daha xarabalığı gözdən keçirdi.* Ə.Məmmədxanlı. [Nuriyyə:] *Gözüm otağın yarımqaranlığına alışandan sonra adi taxtadan düzəlmiş rəflərdəki kitabları gözdən keçirdim.* İ.Əfəndiyev; 3) yoxlamaq. *Kağızları gözdən keçirmək. Biletləri gözdən keçirmək. – Biz Acı körpüsünü keçib şose yolu idarəsinə çatana qədər iki yerdə vəsiqələrimizi gözdən keçirdilər.* M.S.Ordubadi. **Gözdən kənara buraxmamaq** – b a x **gözdən qoymamaq**. *Yazıqları .. gözdən kənara buraxmadılar.* M.S.Ordubadi. **Gözdən qaçmaq** – görünməmək, diqqətdən kənarda qalmaq. **Gözdən qoymamaq** – birinin bütün hərəkətlərinə fikir vermək, diqqət yetirmək, təqib etmək, nəzarət altında saxlamaq, izləmək. *Uşağın hərəkətlərini gözdən qoymamaq. – Mən qaraçı qızını gözdən qoymurdum.* M.S.Ordubadi. *Firuzə xəstəni bir an gözdən qoymurdu.* A.Şaiq. **Gözdən (gözlərdən) olmaq** – kor olmaq. [Qəribin atası:] *Gecə-gündüz axıdıram göz yaşı; Gözdən oldum oğul-oğul deməkdən.* "Aşıq Qərib". **Gözdən pərdə (əsgi) asmaq** – aldatmaq; həqiqəti gizlədib yalan danışmaq, kələk işlətmək, nöqsanların üstünü örtmək. [Nəsib dayı:] *Görürəm səninlə danışmaq çox çətindir, Kosaoğlu. Sən başa düşmürsən ki, .. gözdən pərdə asmaq ən böyük cinayətdir?!* İ.Şıxlı. **Gözdən salmaq** – 1) etina etməmək, unutmaq, yaddan çıxartmaq. *Bir qədər keçəndən sonra musiqiyə olan həvəsim o qədər azaldı ki, başıbəlalı tütəyi bilmərrə gözdən saldım.* C.Məmmədquluzadə. *Aydın qələbəsinin bu cür gözdən salınmağına dözürdü.* M.Hüseyn; 2) uzaqlaşdırmaq, kənar etmək. *Ələsgəri gözdən salma irağa; Necə dözüm belə dərdü fərağa?* Aşıq Ələsgər. **Gözdən tük çəkmək** – bir işi çox cəld və məharətlə görmək. *Bilmirsən ki, oğrular gözdən tük çəkirlər?* Mir Cəlal. **Gözdən uzaq (iraq)!** – qorxu, vahimə, xof və s. qarşısında işlədilən ifadə. *Həm də, gözdən iraq, gəlinlər, qızlar; Əlləri qoynunda zarıyıb sızlar.* S.Vurğun. **Gözdən uzaq (iraq) olmaq (düşmək)** – bir-birindən ayrı düşmək, aralı yaşamaq, uzaqda olmaq, qürbətə düşmək. *Gözdən uzaq olan könüldən də uzaq olar.* (Məsəl). **Gözdən yayınmaq** – qaçıb gizlənmək, qaçmaq, əkilmək, gözə görünməmək. [Ələmdar] *mühafizlərin gözündən yayınmağı kəsdirdi.* S.Rəhimov. [İlyas Adiləyə:] *Elə ki, həyatin aşağısına gəlib gözdən yayındım, o saat qayıdıb Tərlanın boynuna sarıldım.* Ə.Məmmədxanlı. **Gözə batmaq** – b a x **gözə girmək**. [Altunbay:] [Qullar] *ox kimi gözə batırlar.* C.Cabbarlı. **Gözə dəymək (çarpmaq)** – görünmək, görsənmək, diqqəti cəlb etmək. [Qarovul:] *Gedən yoldaşlardan da gözə bir nişan dəyməyir.* Ə.Haqverdiyev. *Hazır olanlar sırasında birinci növbədə gözə çarpan Hacı Qəvam idi.* T.Ş.Simurq. **Gözə (gözlərə) fərəh vermək** – sevindirmək, ürək açmaq, könlü xoş etmək. *Gözəl mənzərə gözə fərəh verir. – Göz işlədikcə yamyaşıl otlar, göy çəmənlər və rəngarəng yarpaq və meyvələrlə bəzənmiş ağaclar gözlərə fərəh verir.* M.Rzaquluzadə. **Gözə gəlmək** – 1) b a x **gözə görsənmək (görünmək)**. *Bulud qara, göy qara; Bu qaranlıq gecədə; Gözə gəlir göy qara.* S.Vurğun; 2) vecinə gəlməmək, saymamaq; 3) b a x **göz dəymək**. *Bu gecə sizə gəlləm; Pəncərənizə gəlləm; Üzərriyi götür, gəl; Yoxsa mən gözə gəlləm.* (Bayatı). **Gözə gətirmək** – mövhumi təsəvvürə görə guya baxışı ilə ziyan vurmaq, bəlaya salmaq.

*Uşağı gözə gətirmək. Mal-qaranı gözə gətirmək.* – [Qarı:] *Eh, oğlumu gözə gətirdilər.* S.Vəliyev. **Gözə girmək** – diqqəti özünə cəlb etməyə çalışmaq, həmişə göz qarşısında olmağa çalışmaq, özünü gözə soxmaq, özünü göstərmək. *..Mən gözə girmək üçün yox, vətənə xidmət etmək üçün çalışıram.* Ə.Əbülhəsən. [Həbibə] *bu fikrə gəlmişdi ki, nə qədər kefi saz olsa da, paltarını dəyişməsin, gözə girməsin.* Mir Cəlal. **Gözə görünmək (görsənmək, çarpmaq)** – nəzərə çarpmaq, diqqəti cəlb etmək. *Birdən-birə göründü gözə bir xərabəzar; Görsən nə qəmli mənzərələr aşkar idi.* M.Hadi. [Hamamda] *əvvəl gözə görünən divardakı su küpü idi.* Çəmənzəminli. **Gözə xoş görünmək (gəlmək)** – xoşa gəlmək, bəyənilmək, xoşlanmaq. [Sila:] [Qız] *güləndə də, qüssələnəndə də, düşünəndə də həmişə gözə xoş gəlir.* S.Vəliyev. **Gözə kül (torpaq) atmaq (səpmək, üfürmək)** – aldatmaq, kələk gəlmək, hiylə işlətmək. **Gözə sataşmaq** – b a x **gözə dəymək**. *Qabaqda oturan qız orada yenə Dursunun gözünə sataşdı.* Ə.Əbülhəsən. **Gözə soxmaq** – diqqət mərkəzində qoymaq, diqqəti cəlb etmək, nəzəri cəlb etmək. *İşini gözə soxmaq.* – [Surxay Dövlət bəyə:] *Zavod və milyonlarınızı da çox gözümə soxmayın.* C.Cabbarlı. [C.Məmmədquluzadə] *əsərlərini gözə soxmağı, özündən danışmağı sevməzdi.* M.İbrahimov. **Gözə torpaq tullamaq** – b a x **gözdən pərdə (əsgi) asmaq**. **Gözləri açıla qalmaq** – heyran olmaq, heyrətdə qalmaq. *Qızın gözəlliyi qarşısında gözləri açıla qaldı.* **Gözləri alacalanmaq** – təəccüb, qorxu nəticəsində gözləri irilənmək, iri açılmaq. *Alman öz süngüsü ilə onun zərbələrini dəf etməyə çalışaraq dal-dalı çəkilir və gözləri alacalanmış, gülünc bir ifadə ilə nə isə mırıldanır.* İ.Əfəndiyev. **Gözləri batmaq** – b a x **gözləri çuxura düşmək**. *Acından, soyuqdan çıxır donqarı; Batıb gözləri, rəngi olub sapsarı.* Ə.Nəzmi; // zəifləmək, taqətdən düşmək. *Şahsuvar tərəfə patron boşaltdı; Qüvvədən düşərək gözləri batdı.* S.Vurğun. **Gözləri böyümək** – təəccübdən, heyrətdən, qorxudan gözlərini iri açmaq. *Gözləri böyüdü sanki vəhşətdən; Qamaşdı o yüksək mədəniyyətdən.* Şəhriyar. **Gözləri hədəqəsindən çıxmaq** – b a x **gözü (gözləri) kəlləsinə çıxmaq**. *Boğazı qurumuş, dili qurumuş; Çıxmışdır gözləri hədəqəsindən.* M.Müşfiq. **Gözləri ilə süzmək** – başdan-ayağa baxmaq, tamam nəzərdən keçirmək. *Molla ikrah edirmiş kimi bir-iki addım geri çəkilib dayandı və əli ilə Kürdən əsən mehin oynatdığı ütülmüş saqqalını tumarlaya-tumarlaya gələnləri qıyıq gözləri ilə süzdü.* İ.Şıxlı. **Gözləri işıqlanmaq** – b a x **gözləri parıldamaq**. *Qızılı görən zindanbanın gözləri işıqlandı.* "Qurbani". **Gözləri qan çanağına dönmək** – gözlərinin içi qanla dolmaq, bərk qızarmaq. *Ömər koxanın üzü tunc kimi bozardı. Qalın qaşları pırpızlandı və gözləri qan çanağına döndü.* İ.Şıxlı. **Gözləri quyuya düşmək** – çox arıqlamaq, gözləri batmaq, çökəyə düşmək. **Gözləri parıldamaq** – üzündə sevinc görsənmək, fərəh içərisində olmaq. [Bədircahan:] *..Sənin söhbətin ortalığa düşəndə Züleyxa xanımın barmağını kəssən, xəbəri olmaz, elə üzü gülür, gözləri parıldayır...* N.Vəzirov. **Gözləri süzülmək** – göz qapaqları xəfif-xəfif qapanmağa başlamaq, yuxu basmaq. **Gözlərindən yuxu tökülmək** – bərk yuxusu gəlmək, şiddətli şəkildə yuxulamaq istəmək. *..Gözlərindən yuxu tökülən Kosa alçaq .. çarpayıya tərəf yenərək .. ah çəkdi.* S.Rəhimov. **Gözlərinə qaranlıq çökmək, gözlərinin qabağı qaralmaq** – b a x **gözü (gözləri) qaralmaq**. **Gözlərini açmaq** – 1) oyanmaq. *Sabahı günü Cəlil ağa gözlərini açanda özünü bir qeyri aləmdə, bir qeyri mühitdə gördü.* İ.Musabəyov. *Rəngi qaçmış Afaq gözlərini açıb onu başı üzərində görərkən, ilk dəfə ana olmuş qadına məxsus bəxtiyar bir təbəssümlə gülümsədi.* Ə.Məmmədxanlı; 2) ayıltmaq, başa salmaq, oyandırmaq. *Cəmilənin sözləri* [Mirzağanın] *qapalı gözlərini açır, hansı mühit içərisində yaşadığını ona qandırırdı.* S.Hüseyn; 3) başa düşmək, dərk etmək, ayılmaq. *Mən gözlərimi açdıqda özümü belə zəngin bir təbiət içində gördüm.* S.S.Axundov. **Gözlərini ağzına dikmək** – diqqətlə birinə qulaq asmaq, yaxud birinin nə deyəcəyini səbirsizliklə, diqqətlə gözləmək. *Hamı gözlərini sədrin ağzına dikmişdi.* – *Məclisdə olanların hamısı*

*gözlərini Hacı əminin ağzına dikmişdi.* M.S.Ordubadi. **Gözlərini dolandırmaq** – ətrafa göz gəzdirmək, dörd tərəfini seyr etmək. *Böyükxanım gözlərini dolandırıb, oğlanlarına baxıb daha da dilgir olurdu.* M.S.Ordubadi. *Həmzə gözlərini dolandırıb Şahmara tərs-tərs baxdı, rişxəndlə gülümsündü.* B.Bayramov. **Gözlərini dörd açmaq** – həddindən artıq diqqətli olmaq, çox fikir vermək. **Gözlərini oxşamaq** – xoşlamaq, bəyənmək, gözünə xoş gəlmək. [Qumru] ..*Hansı tərəfə dönürdüsə, daha şux bir rəng gözlərini oxşayıb, onu özünə doğru çağırırdı.* Ə.Məmmədxanlı. **Gözlərini sıxmaq** – bax **gözünün qorasını sıxmaq**. *Üzünü aşağı tutub, gözlərini sıxdı.* Mir Cəlal. **Gözlərini süzmək** – 1) göz qapaqlarını bir-birinə yaxınlaşdıraraq heyran-heyran baxmaq. [Müəllim:] [Tələbə] *mənim suallarıma cavab verəndə başını aşağı əyir, gözlərini süzür və ancaq*: *– Nə? – deyirdi.* Qantəmir; 2) nazlanmaq, naz-qəmzə etmək. *Sən ha Qurbaninin canın üzərsən! Qaş oynadıb gözlərini süzərsən.* "Qurbani". **Gözlərinin ağı saralmaq** – xəstələnmək, azarlamaq. ..*İztirabdan bu gün üzün qaralıb; Gözlərin ağı sərbəsər saralıb.* S.Ə.Şirvani. **Gözlərinin içi gülmək** – çox sevindiyi üzündən-gözündən bilinmək. **Gözü ac olmaq** – tamahkar olmaq, heç şeydən gözü doymamaq, daim gözü bir şeydə olmaq. **Gözü (gözləri) açılmaq** – dərk etməyə başlamaq, ayılmaq, qəflət yuxusundan oyanmaq, fəaliyyətə, hərəkətə gəlmək, yaxşı-yamanı seçmək. [Zakirov Sədəfə:] [Şeyda] *Göytəpədə çox yubandı, kim bilir, bəlkə orda gözü açıldı.* Ə.Məmmədxanlı. **Gözü (gözləri) ağara qalmaq** – təəccübdən, qorxudan gözləri irilənmək, iri açılmaq, gözləri bərəlmək. **Gözü (gözləri) ağarmaq** – 1) gözü pərdə basıb kor olmaq, görməmək; 2) bir işi sona çatdırınca böyük əzab çəkmək, əziyyətə qatlaşmaq. [Telli:] *Bir yandan ömrü gödəlmiş Heydərqulu ağa mənə göz verir, işıq vermir, elə fikrə düşür, elə qələt eləyir ki, it yesə gözü ağarar...* N.Vəzirov. **Gözü ağrımaq** – *məc.* incimək, xoşu gəlməmək, zəhləsi getmək. *Onu görəndə gözüm ağrıyır.* **Gözü (gözləri) axmaq** – gözü (gözləri) yumulmaq, örtülmək. *Mən hey göyə baxdım, göy mənə baxdı; Yollara baxmaqdan gözlərim axdı.* Ə.Cavad. *Pəncərədən ay baxır; Yenə gözlərin axır.* N.Rəfibəyli. **Gözü almaq** – 1) öyrəşmək, bələd olmaq, alışmaq. *Atların xasiyyətini gözüm elə alıbdır ki, heç bir bədxasiyyət at fikrimə gətirə bilmirəm ki, onu iki-üç günün içində öyrədib faytona qoşa bilməyim.* C.Məmmədquluzadə; 2) *dan.* qalib gələcəyinə inamı olmaq, özünə arxayın olmaq. *Səni gözüm alıb, oyunu udacağam;* 3) müxtəlif şeylərin içərisindən birini bəyənib, xoşlayıb seçmək. *Güllü parçanı gözüm aldı.* **...gözündə qalmaq** – etdiyi arzu, xoş niyyət yerinə yetməmək, kamına çatmamaq. *Muradı gözündə qalmaq. – Məktəbi qurtarmaq üzrə ikən Qəhrəmanın arzusu gözündə qaldı.* S.Rəhimov. **...gözündə qoymaq** – arzusunu, niyyətini yerinə yetirməmək, şad etməmək, sevindirməmək. *Oğul anasının arzusunu gözündə qoydu.* – [Gülsənəm:] *Tahir, mənim muradımı niyə gözümdə qoymusan?* M.Hüseyn. **Gözü (gözləri) ayağının altını görməmək** – qürrələnmək, qudurmaq, heç kəsi saymamaq. **Gözü bağlanmaq (örtülmək)** – heç bir şeyi görməmək, başa düşməmək, fərqinə varmamaq, anlamamaq. [Ziba xanım:] *Sənin gözün örtülüb, uyubsan bir çənginin məkrinə, felinə; təmiz adını, sanını itiribsən.* M.F.Axundzadə. **Gözü (gözləri) böyümək** – təəccüb etmək, heyrətlənmək. *Dürrənin gözləri daha da böyüdü..* S.Vəliyev. **Gözü çıxmış, gözün çıxsın! (tökülsün)** – "kor olasan", "görməyəsən" mənasında qarğış ifadəsi. *Ustadlar ustadnaməni iki deməyib, üç deyər, biz də deyək üç olsun, yağıların gözü tökülsün.* "Qurbani". *Çıxaydı kaş gözüm, görməyəydi hicranın.* X.Natəvan. **Gözü (gözləri) dikilmək (dikilib qalmaq)** – birinə baxıb durmaq, gözünü ayırmamaq, baxa-baxa qalmaq. *Yuxusu da gecələr uçub ərşə çəkildi; Sübhə qədər gözləri şam çırağa dikildi.* B.Vahabzadə. M.Hüseyn. **Gözü (gözləri) dolmaq (doluxsunmaq)** – ağlamaq dərəcəsinə gəlmək, gözləri yaşla dolmaq. *Sanki boğmaq istər göz yaşı seli; Qəribin gözləri dolar axşamlar.* Ə.Cavad. *İndi isə* [Nərgizin] *anasının gözləri dolmuşdu.*

Ə.Məmmədxanlı. *Sevincindən Dürrənin gözləri doluxsundu.* S.Vəliyev. **Gözü doymamaq** – 1) həris olmaq, tamahkarlıq eləmək, hər şeydə gözü qalmaq. *Gözüm doymaz sənin kimi canandan; Cananın itirən tez olar candan.* "Qurbani". *Ələsgər heç çıxmaz qəm libasından; Gözü doymaz gözün təmənnasından.* Aşıq Ələsgər; 2) acgözlük eləmək, gözü yemək dalınca qalmaq. *Acın qarnı doyar, gözü doymaz.* (Ata. sözü); 3) arzusuna, məramına axıra qədər çatmamaq. **Gözü (gözləri) dörd olmaq** – diqqətlə baxmaq, nəzərdən keçirmək. *Üzüyümü itirmişəm, gözüm dörd olub. – Hər yana baş vurur, gözü dörd olur; Özgənin sevinci ona dərd olur.* S.Rüstəm. **Gözü dumanlanmaq** – hirsindən, qəzəbindən gözü heç bir şey görməmək. *Gözü dumanlandı, nitqi tutuldu; Görüncə süzülən o baxışları.* B.Vahabzadə. **Gözü düşmək** – 1) görüb aşiq olmaq, vurulmaq, sevmək. *Çərşənbə günündə çeşmə başında; Gözüm bir alagöz xanıma düşdü.* Aşıq Ələsgər. [Asya:] *Aha, bildim, arşınmalçıya gözün düşübdür.* Ü.Hacıbəyov. *Bəy, qonşunun qızına gözüm düşüb.* Ə.Haqverdiyev; 2) birdən görmək, gözünə dəymək, gözü sataşmaq. *Qonşu otağa gözüm düşdü. – Bağrım şan-şan olur zənbur evitək; Gözüm ki sən gəzən otağa düşər.* Q.Zakir. **Gözü gəzmək** – 1) axtarmaq; 2) hər tərəfə baxmaq, hər yeri nəzərdən keçirmək. *Kənkanın gözü dörd tərəfi gəzdi.* S.Rəhimov. **Gözü götürməmək** – birinə darılmaq, paxıllıq etmək, qibtə etmək. [Səməd bəy:] *Rejissorun Oqtayı gözü götürmür, gəlib ona rəqib olacağından qorxur.* C.Cabbarlı. **Gözü gözündən uzaq** – ayrı düşmüş, aralı. *Çıxmaz yadımızdan, çıxmaz yaradan; Gözü gözümüzdən uzaq olsa da!* H.Arif. **Gözü (gözləri) gülmək** – fərəh içərisində olmaq, məmnunluq, sevinc izhar etmək, şad olmaq. *Zəhra və Həsən minnətdarlıqla* [Firuzəyə] *baxanda gözləri gülürdü.* M.İbrahimov. *Analar fərəhlə baxırlar sənə; Körpə balaların gülür gözləri.* N.Rəfibəyli. **Gözü (gözləri) heç bir şey görməmək** – hissə qapılıb hər şeyi unutmaq, heç bir şey gözündə olmamaq. **Gözü ilə görən** – şahid. **Gözü ilə görmək** – bir işin, hadisənin şahidi olmaq. [Xortdan:] *Gözümlə görəndən sonra məndə şəkk yeri qalmadı.* Ə.Haqverdiyev. *..Bunları gözümlə görmüşəm ..* Mir Cəlal. **Gözü ilə (də) görmək istəməmək** – zəhləsi getmək, heç üzünə baxmaq istəməmək. *Çünki onun sevdiyi Şəfiqə Lütfəlini gözü ilə də görmək istəmirdi.* İ.Musabəyov. **Gözü ilə yemək** – bütün diqqəti ilə baxmaq, dik-dik baxmaq. *Oturduğu yerdə* [Tükəzban] *istəyirdi ki, kağızın hərflərini gözü ilə yesin.* B.Talıblı. **Gözü işləməmək** – görməmək, gözü zəifləşmək. [Kərəm:] *Qocalıbsan, daha gözün işləmir.* "Əsli və Kərəm". **Gözü (gözləri) kəlləsinə çıxmaq** – bərk hirslənmək, qəzəblənmək; 2) həddindən artıq təəccüblənmək, heyrətlənmək. **Gözü kimi** – çox əziz, çox qiymətli. **Gözü-könlü açılmaq** – şadlanmaq, sevinmək, ürəyi açılmaq, könlü açılmaq, fərəhlənmək. *Gəzməyə çıx, gözün-könlün açılsın.* **Gözü (gözləri) qabağında (qarşısında, önündə) durmaq (olmaq, dikəlmək, canlanmaq)** – xatirindən çıxmamaq, həmişə yadında olmaq. *Onun gözləri önündə iki həyat, iki tale canlanırdı.* M.Rzaquluzadə. *Yaşıl budaqları ilə ətrafı bürüyən bir ağac gözü qarşısında canlandı.* S.Vəliyev. *Təmkinlə, ürəklə danışır qonaq; Durur göz önündə o ana torpaq.* B.Vahabzadə. **Gözü qalmaq** – 1) gördüyü bir şeyin həsrətində olmaq, həsrətini çəkmək, əldə etmək arzusunda olmaq. *Paltoluq parçada gözüm qaldı. – Gözüm qaldı kirpiyində, qaşında; Qul et, durum qolubağlı qarşında.* Aşıq Ələsgər; 2) baxa-baxa durmaq, gözünü çəkməmək, nəzərini ayırmamaq, bir şeyin xoş təsirindən qurtara bilməmək. *Gözü qızın üzündə qalıb.* **Gözü (gözləri) qamaşmaq** – parıltıdan, şəfəqdən bir şeyə baxa bilməmək. *Brilyantlar gözü qamaşdırır. – Elə isə bəs neçin; Baxırkən bu şeylərə; Qamaşdı gözlərin?* B.Vahabzadə. **Gözü (gözləri) qaralmaq** – 1) halı pisləşmək, başı fırlanmaq, bayğınlıq halına gəlmək. [Xortdan:] *Gözlərim qaraldı, başım gicəlləndi.* Ə.Haqverdiyev. [İlyas:] *..Başıma endirilən qılınc zərbəsindən gözlərim qaralır, mən üzüstə Tərlanın boynuna yıxılıram.* Ə.Məmmədxanlı. [Cəlalın] *.. gözləri qaralır, ətraf başına fırlanırdı..* S.Vəliyev; 2) dəhşətə gəlmək, qorxmaq.

*Pələngdən elə bir nərilti qopdu ki, səsindən dağ-daş titrədi, gözlərim qaraldı.* A.Şaiq. *Gah elə enir ki, gözüm qaralır; Gah elə qalxır ki, dözməyir ürək.* H.Arif. **Gözü qayıtmamaq** – bax **gözü doymamaq**. *Qayıtmaq istəməz gözüm gözəldən; Qayğımı artıran, dərdim təzəldən.* "Qurbani". **Gözü qızmaq (qızarmaq)** – hirsindən, qəzəbindən heç kəsi gözü görməmək, bərk coşmaq, həddindən artıq qızışmaq. *Rövzəxana dəydi baqqalın sözü; Dişlərin qıcıdıb qızardı gözü.* M.S.Ordubadi. *Gözüm qızdı, dedim: – Mənə Xoruzoğlu deyərlər.* S.Rəhimov. **Gözü qorxmaq** – acı təcrübədən sonra ehtiyatla hərəkət etmək, bir zərər, bədbəxtlik ola biləcəyini yadda saxlamaq. *Gözüm qorxub, dənizdə çimə bilmərəm.* **Gözü (gözün) olmaq** – muğayat olmaq, qorumaq, nəzarət etmək. [Zeynal:] *Uşaqlarda gözün olsun!* S.Hüseyn. [Dilara:] *Tapşırdım, gözü onda olsun.* Ə.Məmmədxanlı. **Gözü (gözləri) önünə (qabağına) gəlmək** – təsəvvüründə canlanmaq, yadına düşmək. *..Mehriban çobanın surəti gözləri önünə gəldikdə, Səmədin qəlbində nakam məhəbbətin yarası daha şiddətlə sızıldamağa başlamışdı.* İ.Hüseynov. **Gözü örtülmək** – ətrafındakı hadisələri dərk edə bilməmək, anlamamaq, qəflətdə olmaq, bəsirətini itirmək. [Ziba xanım:] *Sənin gözün örtülüb, uyubsan bir çənginin məkrinə, felinə, təmiz adını-sanını itiribsən.* M.F.Axundzadə. **Gözü (gözləri) pərdələnmək** – bax **gözü (gözləri) qızmaq**. [Ceyniz:] *Hirsdən ikisinin də gözləri pərdələnib bir-birinə hücum etməyə başladılar.* Çəmənzəminli. **Gözü (gözləri) pər-pər çalmaq** – bax **gözləri parıldamaq**. **Gözü (gözləri) sataşmaq (ilişmək)** – birdən görmək. *Huş başımdan çaşdı, dilim dolaşdı; Gözlərim sataşdı, buxağa düşdü.* Aşıq Ələsgər. [Bəypolad:] *..Gözlərim bağçanı şənlədən çiçəklərə ilişdi.* H.Cavid. *Nərgiz kəskin bir hərəkətlə geri döndü, gözləri Nərminə xalamın gözlərinə sataşdı.* Ə.Məmmədxanlı. **Gözü seçməmək** – zəif görmək, çətinliklə ayırd etmək, yaxşı görməmək, görə bilməmək. [Qoca:] *Ay uşaq, gözüm seçmir, bir görün o gələn atlı kimdir?* İ.Əfəndiyev. **Gözü su içməmək** – inanmamaq, etibar etməmək, şübhə etmək. *Arvadı bundan soruşdu ki, ustalar nə istəyirlər, .. cavab verdi ki, ustalardan gözü su içmir.* C.Məmmədquluzadə. [Aslan bəy:] *Mənəf, axır sənin bu oğlundan heç mənim gözüm su içmir.* Ə.Haqverdiyev. **Gözü (gözləri) süzülmək** – 1) göz qapaqları qapanmağa başlamaq, yuxusu gəlmək. *Əsgərin .. gözləri süzülürdü.* Ə.Əbülhəsən. [Fəridə Qurbana:] *Qurban dayı,* [çağanın] *gözləri süzülür, deyəsən, yatacaq..* Ə.Məmmədxanlı; 2) xumarlanmaq, gözləri yarıqapalı bir vəziyyətə gəlmək. *Gözləri süzüldü, canım üzüldü; Vurubdur sinəmə yara qaşların.* Aşıq Ələsgər. **Gözü tox olmaq** – heç bir şeydə gözü olmamaq, nəfsi az olmaq. *Könlü açıq, gözü toxdu Şəmşirin; Oynasın taleyi, bəxti Şəmşirin.* Aşıq Şəmşir. **Gözü tutmaq** – xoşlamaq, bəyənmək, sevmək, aşiq olmaq. [Səriyyə:] *Mənim ürəyim* [Rüstəmi] *sevir, mənim gözüm onu tutub, mən ona aşiqəm..* C.Cabbarlı. **...gözü uçmaq** – birini görməyə çox can atmaq, şiddətli arzu hiss etmək (bəzən də bu ifadə istehza kimi "şəni görməyə çox gözüm uçurdu" şəklində işlənir). **Gözü üstündə olmaq** – daim nəzarət etmək, himayə etmək, qayğısına qalmaq. [Mayor Cavanşir bəyə:] *Harda olsam, gözüm sizin üstünüzdə olacaq.* Ə.Məmmədxanlı. **Gözü (gözləri) yaşarmaq (yaşla dolmaq)** – ağlamağa başlamaq. *Cavan komandanın da qocanın bu halətinin təsirindən gözləri yaşardı.* Ə.Haqverdiyev. *Zəhra analarını itirmiş on üç qızın halını, ürək parçalayan səmimi göz yaşlarını görərək, ixtiyarsız gözləri yaşardı.* S.Hüseyn. *Şiddətli qamçıdan Bahadırın gözləri yaşardı..* M.Hüseyn. **Gözü (gözləri) yol çəkmək** – 1) gözləri bir nöqtəyə zillənib qalmaq; 2) gözü yolda olmaq, gözləmək. *Görürəm eşqinlə gözü yol çəkən; Dağlar pərisini, dağlar qızını.* S.Vurğun. *Dörd il vardı, ananın gözləri yol çəkirdi; Başqa bir fikri yoxdu, oğul fikriydi dərdi.* S.Rüstəm. **Gözü (gözləri) yolda (yollarda) qalmaq** – sevilən, əzizlənən bir adamın yolunu gözləmək, intizarında qalmaq. *Göz qalar yollarda, can intizarda; Gəlmədi canandan bir xəbər mənə.* Q.Zakir. **Gözü (gözləri) yollara baxmaq** – bax **gözü (gözləri) yolda qalmaq**. *Gecə-gündüz gözüm baxdı yollara;*

*Bir laçın gözlünün nigaranıdı.* Q.Zakir. **Gözü (gözləri) yumulmaq** – yatmaq istəmək. [Mozalanbəy:] *Mənim gözüm yumulur və mürgüləyirəm.* Ə.Haqverdiyev. **Gözümün (gözünün) işığı (nuru)** – sevgi, riqqət, əzizləmə ifadəsi. [Qərib:] *Ey mənim gözümün işığı, qəlbimin soltanı, gedirsən nədir?* "Aşıq Qərib". [Məsud:] *Gözünün işığı, yeganə ümidi bir qızcığazı var idi, o da əlindən getdi.* H.Cavid. [Nisə xala:] *Ay gözümün işığı, ürəyimin tabı.* Mir Cəlal. **Gözün (gözlərin) aydın (olsun)!** – gözaydınlığı, təbrik ifadəsi. *Gözün aydın olsun, könlün olsun şad.* Aşıq Ələsgər. *Mən xalama dedim*: *– Xalacan, gözün aydın olsun, sabah Yaqutun toyudur.* Ə.Məmmədxanlı. **Gözündə canlanmaq** – xatirinə gəlmək, yadına düşmək. *Keçmiş günlər gözümdə canlanır. – ..Sirkan, kolları basmış meydança gözümdə canlanır.* M.İbrahimov. **Gözündə qaldırmaq** – etibarını daha da artırmaq, hörmətini daha da çoxaltmaq. [Bu iş] *Veysi bir neçə saat ərzində tanımayanların da, tanıyanların da gözündə çox qaldırmışdı.* Ə.Əbülhəsən. **...gözündə böyümək, yüksəlmək** – hörməti artmaq, dərəcəsi yüksəlmək, qiymətlənmək, etibar qazanmaq. *Bizi tanış etdilər, çox xoşuma gəldi qız; İncə gülüşlərilə gözümdə yüksəldi qız.* S.Rüstəm. *Qasım indi Ələşrəfin gözündə böyüdü, yüksəldi.* Mir Cəlal. **Gözündə olmamaq** – müəyyən səbəblərə görə ürək sıxıntısı, rahatsızlıq duymaq, gözündən düşmək (adətən "gözümdə deyil" şəklində işlənir). *Ev-eşik gözümdə deyil.* **Gözündən batmaq** – 1) qurumaq, su çıxmamaq (çeşmə və s. haqqında). *Bulaq gözündən batıb;* 2) məhv olmaq, bərbad olmaq, heç-puç olmaq. *İşlərim gözündən batdı.* **Gözündən düşmək** – daha maraqlanmamaq, bir şeyə qarşı marağını itirmək *..Dünya gözümdən düşdü, qəza məni səhraya saldı, mənə nə qaldı?* A.Divanbəyoğlu. **Gözündən gəlsin!** – nankor adama qarğış ifadəsi. [Sənəm:] *Əlimlə sənə verdiyim duz-çörək sənin gözündən gəlsin.* Ə.Haqverdiyev. **Gözündən itmək** – heç bir şey görməmək, hiss etməmək. *Qaraca qız* [qonaqlıqda oynarkən] *elə coşmuşdu ki, orada olan adamlar onun gözündən itmişdi.* S.S.Axundov. **Gözündən kənara qoymamaq** – öz yanında saxlamaq, daim nəzarəti altında saxlamaq. *İndi o gündən Paşa Telli xanımı öz yanına köçürüb gözündən kənara qoymur.* "Koroğlu". **Gözündən qaçmamaq** – hər şeyi görmək, duymaq, hər işə fikir verib bilmək, diqqətli olmaq. *Gözündən heç nə qaçmır.* – [Səlimin] *bu hərəkəti ustanın gözündən qaçmadı.* Y.Əzimzadə. **Gözündən od tökmək** – yanıqlı-yanıqlı ağlamaq. [Nəbi:] *Bu gün bizim Güllü gəlib mənim yanıma, ağlayır, gözündən od tökür.* Ə.Haqverdiyev. **Gözündən od tökülmək** – 1) zirək, diribaş adam haqqında; 2) bərk hirsli olmaq, üz-gözündən qəzəb yağmaq. *Məmmədhüseyn əhvalatı eşitmişdi. Darvazadan girəndə gözündən od tökülürdü.* Mir Cəlal. **Gözündən (gözündə, gözlərindən) oxumaq** – gözlərinin ifadəsindən bilmək, sezmək. *Ürəyindən keçənləri gözlərindən oxumaq.* – [Kərim babanın] *keçirmiş olduğu uzun bir tarixi hər zaman gözlərindən oxumaq olurdu.* A.Şaiq. **Gözündən tökmək** – nəşəsini pozmaq, zövqünü korlamaq, haram eləmək, burnundan tökmək. *O meyi-nab ki, vəslində səninlə içdim; Qan edib tökdü gözümdən ələmi-hicranın.* S.Ə.Şirvani. **Gözündən tük də yayınmaz** – son dərəcə ayıqsayıq adam haqqında. *Səlbinin gözündən tük də yayınmazdı.* Ə.Vəliyev. **Gözündən uzaqda (olmaq)** – ailədən kənar yaşamaq, aralı olmaq, yad yerdə yaşamaq, qürbətə, yad ölkəyə düşmək. [Cavanşir] *Göy atı .. atı ilxıya qatıb, gözündən uzaq etmək istədi.* İ.Şıxlı. **Gözündən yağmaq** – bilinmək, hiss edilmək, görünmək. *Zəhra! Nə qədər də qocalıb fağır; Üzündən-gözündən kasıblıq yağır.* B.Vahabzadə. **Gözünə ağ salmaq** – əzab vermək, əziyyət vermək, incitmək. **...gözünə almaq** – əvvəlcədən baş verəcək hadisəni, işi, fəlakəti duymaq, hiss etmək, nəzərdə tutmaq. *Ölümünü gözünə almaq. – Artıq hər bir şeyi gözünə almış Odunçuoğlu yenə bayaqkı sakit səslə cavab verdi..* Ə.Məmmədxanlı. **Gözünə batmaq (girmək)** – 1) daim görünmək, göz qabağında olmaq. *Hər gün küçələrdə .. gözümüzə batan qorodovoy və qazaqlardan əsər yox idi.* A.Şaiq; 2) qibtə oyatmaq, həsəd oyatmaq.

*Elə bil gözünə batıram.* **Gözünə çökmək** – basmaq, qaplamaq, tutmaq. *Gözünə qüssə çökmək. – Əjdərin gözünə çökmüşdü duman; Qurbanın üzündə qalmamışdı qan.* H.K.Sanılı. **Gözünə dəymək (ilişmək, sataşmaq)** – görünmək, rastlaşmaq. [Xanhüseyn:] *Nəbi dünəndən bəri gözümə dəymir.* "Qaçaq Nəbi". *Dəydi gözlərinə ağappaq divar*; *Elə bil başında ildırım çaxdı.* B.Vahabzadə. **Gözünə döndüyüm** – birisinin işini, ya hərəkətini bəyəndikdə işlənən tərif ifadəsi. [Firidun bəy:] *Gözünə döndüyüm, faytonu tərpədib bunun böyründən nə tövr ilişdirdisə, təpəsi üstə getdi lığın içinə, ürəyi getdi.* Ə.Haqverdiyev. **Gözünə dönüm!** – nəvaziş, alqış yaxud nəvazişli xahiş bildirən ifadə. *Gözünə dönüm, bir də oxu!* – [Hacı Əhməd Şərifə:] *Ay bərəkallah, ay gözünə dönüm!* C.Cabbarlı. *Gözünə dönüm, göy ürgə, qaşqa daya ancaq sən çata bilərsən.* İ.Əfəndiyev. **Gözünə durmaq** – çətin görünmək, çətinlik çəkmək, ağır gəlmək. *Qardaşı arvadı ilə özünü danışmağa məcbur etmək indi Qumrunun lap gözünə dururdu.* Ə.Əbülhəsən. *Elə birinci stəkandan hala gəlmiş bu arıq, cılız oğlanın ikinci stəkan lap gözünə durdu.* İ.Şıxlı. **Gözünə dursun!** – b a x **gözündən gəlsin**! [Ağa Kərimxan:] *Əməyim gözünə dursun, Leyla, bu nə işdir, bu nə müsibətdir..* N.Vəzirov. **Gözünə gəlməmək (görünməmək, girməmək)** – vecinə gəlməmək, təsir etməmək. *Dünya üzü sərbəsər əgər hur olsun*; *Görməz gözümə yüz gözü məxmur olsun.* S.Ə.Şirvani. **Gözünə görünmək (görsənmək)** – 1) görmək, bəlli olmaq. [Xəlilin] *ağzından buraxdığı mavi halqaların arasından gözünə bir çox qadın simaları göründü.* Çəmənzəminli. [Səkinə Rüstəmə:] *Ay kişi, gözümə bir təhər dəyirsən.* M.İbrahimov; 2) mövcud olmadığı halda görünmək, təsəvvür edilmək. **Gözünə görünməmək** – hiss edilməmək, duyulmamaq. *Pulunu az-az ver, gözünə görünməsin.* – [Səlim:] *Bunun əkiz-tayından .. sənə mənzil alanda heç izafilik .. gözünə görünmürdü, Ədhəm ağa!* B.Bayramov. **Gözünə xoş görünmək** – ilk baxışda xoşuna gəlmək, bəyənmək. *Parça gözümə xoş göründü.* – [Siçan balası] *pişiyi gördü, oxşayır özünə*: *Xoş göründü pişik onun gözünə.* S.Ə.Şirvani. **Gözünə (gözlərinə) inanmamaq** – 1) gördüyünə inanmamaq. *Gülsənəm arvadın fikrincə Tahir .. görəndə heç gözlərinə inanmayacaqdı.* M.Hüseyn; 2) təsəvvürə gəlməz bir iş qarşısında təəccüblənmək, çaşmaq. *Vəziyyəti gördükdə gözlərimə inanmadım. – Onun bağçasında elə qəribə meyvə ağacları var ki, adam görəndə gözlərinə inanmır.* M.Rzaquluzadə. **Gözünə işıq gəlmək** – canlanmaq, dirçəlmək. *Çörəyi yedim, gözümə işıq gəldi. – Ədhəmin gözünə işıq gəldi..* B.Bayramov. **Gözünə işıq vermək** – dirçəltmək, canlatmaq, həyat vermək. *Ay doğdu, işıq verdi; Yara yaraşıq verdi; Sinəndən doğan ulduzu*; *Gözümə işıq verdi.* (Bayatı). **Gözünə kölgə çökmək** – arıqlamaq, zəifləmək, gözləri batmaq, çökmək, çuxura düşmək. **Gözünə (gözlərinə) qan sızılmaq** – b a x **gözü (gözləri) qan çanağına dönmək**. [Pəri:] *Hirsindən ovçunun gözlərinə qan sızılmışdı.* Ə.Məmmədxanlı. **Gözünə (gözlərinə) qaranlıq çökmək** – b a x **gözü (gözləri) qaralmaq**. **Gözünə qoymağa ... verməmək** – ən kiçik; ən cüzi miqdarla bir şeyi qıymamaq. **Gözünə pərdə çəkmək** – cəhalətdə saxlamaq, qəflətdə saxlamaq. **Gözünə pərdə gəlmək** – kor olmaq, gözü görməmək. *Bozdar qocalmış, gözlərinə pərdə gəlmiş heyvərə bir köpəkdir.* S.S.Axundov. **Gözünə pərdə salmaq (tutmaq, çəkmək)** – b a x **gözdən pərdə (əski) asmaq**. **Gözünə sataşmaq (dəymək)** – görünmək. *Zalın küncündə bir neçə müsəlman gözümə sataşdı.* Ə.Haqverdiyev. *Qabaqda oturan qız arada yenə Dursunun gözünə sataşdı.* Ə.Əbülhəsən. *..Bir əsgər mənim gözümə sataşdı.* Mir Cəlal. **Gözünə soxmaq** – 1) qabacasına göstərmək; 2) acgözlüklə yemək. *Yeməyi gözünə soxurdu.* **Gözünə su vermək** – ibrət götürmək, ibrət almaq. **Gözünə təpmək** – b a x **gözünə soxmaq** 2-ci mənada. *Çörəyi gözünə təpirdi.* **Gözünə yuxu (çimir) gəlməmək (getməmək)** – yata bilməmək, yatmamaq, qəti gözünü yummamaq; narahat olmaq. *Gəldim, soyundum, girdim yerə, amma sübhədək gözümə yuxu gəlmədi.* Ə.Haqverdiyev. [Tükəzban:] *Anası ölmüş, ev bilmir, eşik bilmir, təkdənbir*

*gələndə də gözünə yuxu getmir.* M.Hüseyn. *Səhər ulduzlar sönənə qədər gözümə yuxu getmirdi.* Ə.Məmmədxanlı. **Gözünü (gözlərini) açmaq** – 1) b a x **göz açmaq**. *O açmağa başlayıb bu dünyaya gözünü.* B.Vahabzadə; 2) ayıltmaq, başa salmaq, bilmədiyini öyrətmək. *Mart ayının 2-də olan nümayiş fəhlə sinfinin gözünü açdı.* M.S.Ordubadi. *Bu silah gözləri açan, insanlara həqiqəti göstərən bir silahdır.* M.Rzaquluzadə; 3) özünə gəlmək, ayılmaq. *Körpə uşaq indi də başının ağrısından gözünü aça bilmir.* B.Bayramov; 4) xilas olmaq, başı ayılmaq (açılmaq). *İşin əlindən gözünü aça bilmir;* 5) diqqət etmək, fikir vermək. *Gözünü aç, yaxşı bax!* **Gözünü ağartmaq** – təhdid etmək, hədələmək, qorxutmaq. [Kazım Kərbəlayıya:] *Niyə gözünü ağardırsan? Səndən qorxan yoxdur.* Çəmənzəminli. [Gülpəri arvad] *Sadıq kişinin qırışmış yanaqlarına .. baxıb gözünü ağartdı.* M.Hüseyn. [Adil:] *Atam məramımı başa düşüb gözünü ağartdı.* B.Bayramov. **Gözünü almaq** – özündən qorxutmaq, çəkinməyə məcbur etmək. **Gözünü (gözlərini) ayırmamaq** – diqqətlə, gözünü ayırmadan bir şeyə baxmaq. *Uşaq gözlərini xalçadan ayırmayıb, yavaş səslə bacısından soruşdu..* Ə.Məmmədxanlı. **Gözünü (gözlərini) bağlamaq** – qəsdən başa düşməyə, ayılmağa qoymamaq, qəflətdə, cəhalətdə saxlamaq. [Bəhram:] *Mənim gözlərimi bağladı.* C.Cabbarlı. **Gözünü (gözlərini) bərəltmək** – b a x **gözünü ağartmaq**. *Hesabdar bəzi adamların adlarının qabağını boş görüb çeşməyinin altından gözünü bərəltdi.* B.Bayramov. **Gözünü (gözlərini) çəkməmək** – uzun müddət baxmaq, davamlı baxışlarla süzmək, gözünü götürməmək. *Xanım bir yerdə durdumu, Həmzə bəy də yerişini yavaşıdıb gözlərini ondan çəkmirdi.* Çəmənzəminli. **Gözünü (gözlərini) çıxartmaq** – 1) kor etmək. *Həmi yandırdı saqqalın, həm üzün*; *Alov az qaldı ki, çıxarda gözün.* S.Ə.Şirvani; 2) birinin paxıllığına səbəb olmaq, qibtə hissi doğurmaq, həsədinə səbəb olmaq. *Mənim çörəkli olmağım bir para adamın gözünü çıxardır.* Ə.Əbülhəsən; 3) *isteh.* bir şeyin yaxşısı qaldığı və ya olduğu halda pisindən yapışmaq, pisini almaq. *Bazarın gözünü çıxarmısan.* **Gözünü (gözlərini) dikmək** – 1) gözünü ayırmadan baxmaq. – [Molla Həmid] *gözünü çadırın səqfinə dikib, sağ əlinin baş barmağı ilə çənəsinə tikyə verib, cavab verir.* M.F.Axundzadə. *Osman gözlərini dikmişdi yerə.* H.K.Sanılı. *Şiraslan gözlərini ..* [Turşsu bulağına] *dikdi.* S.Rəhimov; 2) ümid bağlamaq. *Gözünü böyük oğluna dikmək.* – [Səadət xanım:] *Beş il gözlərimi dikmişəm onun yoluna, indi qəza bizi dübarə ayırmaq istəyir.* N.Vəzirov. [Cəmaləddin:] *Xaricilər vəhşi pələnglər kimi dişlərini qıcıdıb, gözlərini islam məmləkətlərinə dikiblər.* C.Cabbarlı. **Gözünü dörd açmaq (eləmək)** – çox diqqətli olmaq, özünü ayıq saxlamaq. **Gözünü (gözlərini) döymək (döyəcləmək)** – heyrətlə baxmaq, mat-mat baxmaq, məəttəl qalmaq, heç bir şey anlamadan baxmaq. *Hər ikisi .. gözlərini döyürdülər.* M.S.Ordubadi. *Qulam dayı isə bu əhvalatdan heç nə anlamayıb gözlərini döyür..* M.Hüseyn. *Xəstə uşaq gözlərini döyəcləyib həkimin üzünə baxdı və heç bir söz demədi.* Q.İlkin. **Gözünü (gözlərini) götürməmək** – daim baxmaq, gözlərini ayırmamaq. *Qızı görən kimi* [oğlan] *gözlərini qızdan götürə bilmədi..* E.Sultanov. **Gözünü (gözlərini) qan tutmaq (bürümək)** – qan tökməyə hazır olmaq, qan tökəcək dərəcədə hirslənmək. **Gözünü qorxutmaq (qorxuzmaq)** – b a x **gözünü almaq**. [Mərcan bəy:] *Cürətim gəlməyir,* [Minnətxanım] *gözümü bərk qorxuzub.* Ü.Hacıbəyov. [Yusif Səmədə:] *Deyəsən, arvad gözünü qorxudub.* İ.Hüseynov. **Gözünü oğurlamaq** – birisinin diqqətini başqa şeyə cəlb edərək öz işini görmək, yayındırmaq. *Beləcə anamın gözünü oğurlayıb, .. dörd nəfər yaralı çıxarıb gətirdim.* Ə.Əbülhəsən. **Gözünü yerə dikmək** – aşağı baxmaq, başını aşağı salmaq. *Gözünü yerə dikib durmaq.* **Gözünü (gözlərini) yollara dikmək** – həsrətlə yol gözləmək, intizar çəkmək, yol gözləmək. *Görməyə didarını hərdəm çəkər çox intizar; Gözlərini dikmiş, baxır yollara, gördüm Vaqifi.* M.P.Vaqif. **Gözünü (gözlərini) yollardan çəkməmək** – b a x **gözünü (gözlərini) yollara dikmək**. [Musa:] *Dərdlilər yollardan gözünü çəkməz; Haray, bu hic-*

*ranın əlindən, haray!* S.Rüstəm. **Gözünü yuxuya vermək** – 1) yatmaq, yuxulamaq. *Səhərə yaxın gözümü yuxuya verdim*; 2) kələk gəlmək, aldatmaq. **Gözünü (gözlərini) yummaq** – 1) ölmək. *Neçə gündür ki, Azərbaycan .. poeziyasının böyük nəğməkarı, onun öncül bayraqdarı Səməd Vurğun öz şahin gözlərini yummuşdur.* S.Rəhimov; 2) yatmaq. *Vəfalı Hüsniyə rəfiqəsinin yanını kəsdirib sübhə qədər gözlərini yummadı.* S.S.Axundov; 3) hər şeyə qarşı laqeyd olmaq, heç bir şeyə fikir verməmək, soyuqqanlılıq göstərmək, əhəmiyyət verməmək. [Kərimqulu:] *Gərək biz də gözümüzü yumub, özümüzü götürüb o uçurumdan dik başıaşağı ataq, eləmi?* S.Rəhimov. **Gözünü (gözlərini) zilləmək** – gözünü bir nöqtəyə, bir yerə dikib baxmaq. *Səlim gözlərini* [Mehribanın] *gözlərinə zilləmişdi.* S.Hüseyn. *Bəxtiyar tüfəngi doldurub qalxdı; Zilləyib gözünü bir az da baxdı.* S.Vurğun. *Əlindəki kağıza zilləyərək gözünü; Həyatında bəlkə də o ilk dəfə özünü; Xoşbəxt sanırdı bu gün.* B.Vahabzadə. **Gözünün acısını almaq** – azacıq yatmaq, bir qədər yatıb dincəlmək. *Gözlərinin acısını alan Nəbi gün yağlanmamışdan durur, həndəvərə göz gəzdirir.* S.Rəhimov. **Gözünün acısını çıxartmaq** – yatıb yorğunluğunu rəf etmək, yatıb dincəlmək. **Gözünün ağı-qarası** – ailənin bircə övladı, tək uşağı olduqda işlənir. *Ananın gözünün ağı-qarası bircə qızı var.* – [Şah:] *Keşiş, gözümün ağı-qarası bir nəfər oğlum var.* Ü.Hacıbəyov. [Odabaşı:] *Bunun gözünün ağı-qarası Fərman adında bircə oğlu var idi.* Ə.Haqverdiyev. *Sən mehriban ananın ürəyinin parası, gözünün ağ-qarası; Tək oğlusan, əzizim!* Ə.Cəmil. **Gözünün altına almaq** – baş verəcək bir iş və ya hadisəni gözləmək, buna hazır olmaq. *..Başımı Ruqiyyənin döşünə qoyub ölümümü gözümün altına aldım.* A.Divanbəyoğlu. **Gözünün altınca baxmaq** – b a x **göz altından baxmaq**. [Kərbəlayı Qulu] *gözünün altınca dəlləyə baxıb yenə başını aşağı saldı.* Çəmənzəminli. **Gözünün düşməni** – birinin sevmədiyi, xoşuna gəlmədiyi, düşmən kimi baxdığı adam haqqında. **Gözünün içinə baxmaq** – 1) əmri yerinə yetirməyə hazır durmaq; 2) bir istəyin, arzunun yerinə yetirilməsi üçün gözləri ilə yalvarırcasına baxmaq. **Gözünün içinə demək** – söhbəti gedən adamın iştirakından çəkinməyərək nöqsanını və ya başqa bir şeyi arxasınca deyil, üzünə demək. [Əsgər:] *..Budur bax, düz gözünün içinə deyirəm*: – *Oxumur..* N.Vəzirov. [Bəkir:] *Sən mənim nöqsanlarımı gözümün içinə demədin.* İ.Hüseynov. **Gözünün içinə qədər** – lap, tamamilə. *Gözünün içinə qədər yalan deyir.* **Gözünün kökü saralmaq** – gözləməkdən yorulmaq, usanmaq, çox gözləmək. [Koroğlu:] [Dəliləri] *gözləməkdən gözümüzün kökü saraldı.* "Koroğlu". **Gözünün qabağında dayanmaq (olmaq)** – b a x **gözü (gözləri) qabağında (qarşısında) durmaq (canlanmaq)**. [Mürşüd Sənubərə:] *Sənin taleyini düşünəndə o, həmişə gözümün qabağında dayanır.* B.Bayramov. **Gözünün qorasını sıxmaq (tökmək)** – ağlamaq. *Püstə xanım da* [Səlimnaz arvadın] *təsirinə düşüb gözünün qorasını sıxdı.* M.Hüseyn. **Gözünün qurdu ölmək** – ehtiyacı qismən təmin olunmaq; doymaq. *Əvvəlcə verin çörəyi, acqarına işləyən zalım oğlunun gözünün qurdu ölsün.* M.Hüseyn. **Gözünün qurdunu öldürmək** – ehtiyacını azca da olsa təmin etmək (yeməklə). **Gözünün quyruğu (ucu) ilə baxmaq** – hiss etdirməmək üçün altdan-altdan, gözucu baxmaq. [Dərviş:] *..Başımı aşağı salıb, .. gözümün quyruğu ilə o tərəfə baxdım.* A.Divanbəyoğlu. **Gözünün quyruğu (ucu) ilə baxmamaq** – etina etməmək, saymamaq. *O heç gözünün ucu ilə də baxmadı.* M.Rzaquluzadə. **Gözünün odunu almaq** – qabaqcadan bir şeylə qorxutmaq. *..Leylək bəri başdan qoltuqçunun gözünün odunu almaq, malı ucuz satmaq istədi.* S.Rəhimov. **Gözünün üstündə qaşın var deməmək** – heç bir söz deməmək, kefinə, xətrinə dəyməmək, hər cür qüsurunun üstündən keçmək. *İndiyə qədər ona gözünün üstündə qaşın var deyən olmayıb.* **Gözünün zılığını axıtmaq** – b a x **gözünün qorasını sıxmaq**. **...gözü (gözüm) atır** – istehza kimi işlənən ifadə. *Çox səni görməyə gözüm atır.* **...gözüm (gözün, gözü) var(dı)** – istəyirəm (istəyirsən, istəyir), sevirəm (sevirsən, sevir). [Rəşidin] *..həqiqət*

*halda Mehribanda gözü vardı.* S.Hüseyn. *Veysin Minayədə gözü vardı.* Ə.Əbülhəsən.

**GÖZAĞARTMASI: gözağartması vermək** – qorxuducu nəzərlə, hədələyici tərzdə baxmaq, göz ağartmaq. *Əlyarov bu dəfə bulud kimi qaraldı və direktora gözağartması verdi.* M.Hüseyn.

**GÖZALTI** 1. *is*. Sonradan almaq və ya ərə getmək üçün nəzərdə tutulan qız, yaxud da oğlan. *Əlbəttə, heç bir gözaltın varmı?* Ə.Sadıq. [Süsənbər Səməndərə:] *Sözümə cavab vermədin, axı, bəlkə gözaltın var?* B.Bayramov. ☐ **Gözaltı etmək (eləmək)** – 1) sonradan almaq və ya ərə getmək, yaxud bir şeyi sonradan əldə etmək üçün nəzərdə tutmaq. *Qızı gözaltı etmək. – Tahir anasının kənddə gözaltı elədiyi qızı yox, Lətifəni sevdiyini yazmışdı.* M.Hüseyn. [Gülnaz:] *Sən də birini gözaltı eləyib onun haqqında fikirləşərdin.* H.Seyidbəyli; 2) nəzərdə tutmaq, göz qabağında tutmaq, qabaqcadan bilmək. [Kərbəlayı Məmmədəli:] *Bilirsinizmi ki, oğurluq eləyən gərək binamusluğu da gözaltı eləsin.* N.Vəzirov. *Cuma .. özünə tay olacaq bir əsgər .. gözaltı eləməyə çalışacaqdı.* Ə.Əbülhəsən.

2. *zərf* Başqasına bildirmədən, hiss etdirmədən; gizlincə. *Gözaltı nəzər salmaq. – ..Ətrafında vüqu bulan hər bir şeyə* [qadın] *gözaltı baxıb diqqət yetirirdi.* B.Talıblı. *Məşədi Qadir bu xəbəri söyləyəndə gözaltı baxıb nə sayaq təsir edəcəyinə diqqət verirdi.* T.Ş.Simurq. *Qız dönüb gözaltı gözümə baxdı; Bu gizli baxışda sabahı gördüm...* M.Araz.

**GÖZALTILAMA** "Gözaltılamaq"dan *f.is*.

**GÖZALTILAMAQ** bax **gözaltı etmək (eləmək)** ("**gözaltı**"da). *Qız gözaltılamaq.*

**GÖZAYDINLAMA** "Gözaydınlamaq"dan *f.is*.

**GÖZAYDINLAMAQ** *f.* Şad bir hadisə və ya xəbər münasibətilə birini təbrik etmək, gözaydınlığı vermək. *Toy münasibətilə gözaydınlamaq. – Xəbər tutanlar gəlib bu xoşbəxt ataları gözaydınlayırdı(lar)* S.Rəhimov.

**GÖZAYDINLAŞMA** "Gözaydınlaşmaq"-dan *f.is*.

**GÖZAYDINLAŞMAQ** *qarş.* Şad bir hadisə və ya xəbər münasibətilə bir-birini təbrik etmək, bir-birinə gözaydınlığı vermək. *Maral yatdığı yerdə bu gurultulu gözaydınlaşmağı eşitdi..* Ə.Əbülhəsən.

**GÖZAYDINLIĞI** *is.* Xoş bir xəbər və ya yaxşı bir iş münasibətilə birisini təbrik etmə; təbrik. *Hər bulaq başında bir söhbət olur; Gah gözaydınlığı, gah qeybət olur.* S.Vurğun. ☐ **Gözaydınlığı vermək** – "gözün aydın (olsun)" deyərək təbrik etmək. [Vaqif] *Qızxanımla* [Mirzə Əliməmmədin] *ailəsinə gözaydınlığı vermək üçün getdi.* Çəmənzəminli. *Kərbəlayı Xəlilin arvadına bu xəbər çatan kimi, Xavərnisəyə gözaydınlığı vermək və kömək etmək üçün oraya getdi.* T.Ş.Simurq.

**GÖZBAĞLAYICI** *is.* 1. Xüsusi cihaz və ya hərəkətlərin köməyilə tamaşaçıların gözünü yayındıraraq müxtəlif fokuslar (nömrələr) göstərən sirk artisti.

2. *məc.* Başa düşülməyən, üstüörtülü, anlaşılmayan iş, müəmma. *Onun işi lap gözbağlayıcıdır.*

**GÖZBAĞLAYICILIQ** *is.* 1. Gözbağlayıcı artistin işi, peşəsi.

2. *məc.* Fırıldaqçılıq, adam aldatma, fırıldaq. *Gözbağlayıcılıqla məşğul olmaq.*

**GÖZBAĞLICA** bax **gözbağlayıcı** 1-ci mənada. [Məhbubə:] *Mehri! Bu gözbağlıca oyunun axırı pis qurtarar.* H.Seyidbəyli.

**GÖZBƏGÖZ** *zərf* Gözünün içinə baxaraq, üzbəüz, qarşı-qarşıya. *Gözbəgöz oturub danışmaq.* – [Gültəkin:] *Üç aydır ki, dik gözbəgöz* [Aydının] *üzünə baxa bilməmişəm.* C.Cabbarlı.

**GÖZCÜK** *is.* 1. Kiçik göz. *Qarışqanın gözcükləri.*

2. İçəriyə və ya bayıra baxmaq üçün qapıda qoyulan xırdaca deşik; gözlük. *Qapıda balaca bir gözcük də vardı ki, qapı döyüləndə bu gözcükdən baxıb, gələn adamın üzünü görmək mümkün olurdu.* Ə.Əbülhəsən.

3. Tumurcuq. *Gözcüklər yaxşı inkişaf edir. – Çay bitkisini çoxaltmaq üçün 3-4 gözcüyü olan birillik çubuqlardan istifadə etmək lazımdır.* B.Talıblı.

4. Gözə oxşar (dairəvi) şəkildə olan tumurcuq və s. *Kartof yumruları üzərində çuxurcuqlar olur ki, buna gözlüklər deyilir.* M.Qasımov.

**GÖZCÜKLÜ** *sif.* Gözcüyü olan; gözlüklü. *Gözcüklü qapı.*

**GÖZCÜYƏZ** "Göz"dən *oxş.*

**GÖZÇIXARAN** *sif.* Gözlərə kəskin təsir edən, gözü acışdıran. *Gözçıxaran tüstü. – Bakının dəhşətli gözçıxaran tozanağı hamıya məlumdur.* H.Sarabski.

**GÖZƏ** *is. məh.* Sulu, nəmiş otluq, yaşıllıq yer, rütubət çəmənlik. *Əziziyəm gözədə*; *Quzu otlar gözədə*; *Qurban olum sənə də*; *Sənə baxan gözə də.* (Bayatı). *Biz xeyli yol gedib dağətəyi bir gözəyə çıxdıq.* S.Rəhimov.

**GÖZƏÇARPAN** b a x **gözədəyən**. *İranda .. xalqın içərisində gözəçarpan canlanma onları təşvişə salmışdı.* M.İbrahimov.

**GÖZƏDƏYƏN** *sif.* Nəzərə çarpan, diqqəti cəlb edən, yaxşı xüsusiyyəti ilə başqalarından fərqlənən, seçilən, ayrılan. *Gözədəyən şey. – Burda gözədəyən hər şey otaq sahibinin işgüzar bir adam olduğunu göstərirdi.* M.Hüseyn. *Küçələrdə at ayaqlarının tappıltısı eşidilir, arabir təkəm-seyrək gözədəyən keşikçilər görünürdü.* İ.Şıxlı.

**GÖZƏDƏYMƏZ** *is.* Nəzərə çarpmayan, diqqət cəlb etməyən. *Kəndin gözədəyməz yeri. – Tahirzadə məclisin gözədəyməz bir yerində dayanıb müəllimlərlə söhbət edirdi.* Mir Cəlal.

**GÖZƏGƏLƏN** *is.* Gözə xoş gələn; gözəgəlimli. *Gözəgələn ev.* – [Rübabə] *ucaboy, alagöz, qarasaç, gərdənli, gülərüzlü, bir sözlə, gözəgələn bir qız idi.* Mir Cəlal.

**GÖZƏGƏLİMLİ** 1. B a x **gözəgələn**. *..Bu solğunluğu* [Çimnazın] *qara qaş-gözünü daha gözəgəlimli göstərirdi.* Ə.Əbülhəsən.

2. B a x **gözədəyən**. *Gözəgəlimli qız.*

**GÖZƏGƏLİMLİLİK** *is.* Gözə xoş gələn, gözoxşayan şeyin hal və keyfiyyəti.

**GÖZƏGƏLMƏLİ** *sif.* Çox gözəl, çox yaxşı (guya çox gözəl olduğu, yaxud gözəlləşdiyi üçün gözə gələ bilən). [Qəndab:] *Mən yəni beləmi gözəgəlməli olmuşam?* B.Bayramov.

**GÖZƏGÖRÜNMƏZ** *sif.* 1. Gözlə görülə bilməyən; gizlənmiş, görünməyən. [Pərişan atasına:] *Yox, o adət arvadı gözəgörünməz bir çadra altında çürüdür.* M.İbrahimov. *Bir az sonra bütün dərə gözəgörünməz müxtəlif quşların səsi ilə dolmuşdu.* Ə.Məmmədxanlı.

2. Həqiqətdə mövcud olmayan, xəyali qüvvə. *Gözümə neyləsin gözəgörünməz; Canımın ağrıya qalmayıb tabı.* H.Arif. *Gözəgörünməzdən ummadıq kömək; İnsanın özüdür, – dedik, – pənahı.* B.Vahabzadə.

**GÖZƏGÖRÜNMƏZLİK** *is.* Gözə görünməmə, gözlə görünməsi mümkün olmama, mövcud olmama; xəyalilik.

**GÖZƏK** *is. məh.* 1. Bağ, ip. *Atı gözəklə hörükləmək. Çuvalın gözəyini bağlamaq. Məfrəşin gözəyi.*

2. Toxunma şeyin yırtılmış, çürümüş və ya yanmış yerini yenidən toxumaqla salınan yamaq.

**GÖZƏKLİ** *sif.* Gözəyi olan, toxunma yamağı olan: yamaqlı. *Gözəkli xalça.*

**GÖZƏL** *sif.* 1. Sifətinin cizgiləri, bədəninin tənasübü, qaş-gözü qüsursuz olan; göyçək. *Gözəl uşaq.* – [Xor:] *Xəlvət meşə arasında*; *Bir gözəl qız tapmışıq.* C.Cabbarlı. [Zaqs müdiri] *Zeynalın Mehriban kimi gənc və gözəl bir qadını boşamasına bir məna vermədi.* S.Hüseyn. *İçəri gözəl, gənc bir qadın girdi.* S.Rəhman. ◻ **Dünya gözəli –** çox gözəl, çox qəşəng qadın (çox zaman istehza və ya zarafatla işlədilir). [Müqim bəy:] *Sənin kimi dünya gözəli olanın bu dünyada nə dərdi-qəmi, ay Zəriş!* S.Rəhimov. **Gözəllər gözəli** – qeyri-adi gözəlliyi ilə fərqlənən, ən gözəl qız, qadın. // *İs. mənasında.* Sifətinin cizgiləri, bədəninin tənasübü, qaş-gözü qüsursuz olan gənc qız. *Bu gün bir əcayib gözəl sevmişəm; Beləsi olammaz heç vilayətdə.* M.P.Vaqif. [Qarı:] *Ay cavan, atdan düş, bir falına baxım.. Sənin qismətində, deyəsən, bir gözəl var..* Çəmənzəminli. *Parlasın hər gözəlin*: *Bir günəş yaxasında.* M.Müşfiq. // **Gözəlim** şəklində gözələ xitab. *Bu yazıq yarına hərdən; Bir nəzər sal, gözəlim!* Ü.Hacıbəyov. *Aç könlünü, layiq sana hər dürlü mükafat; Sevda! Nə dilərsən, gözəlim, aç mənə, anlat?!* H.Cavid.

2. Gözə xoş gələn, gözü oxşayan, xoşa gələn, qəşəng. *Gözəl bağ. Gözəl mənzərə. – Hanı rəngin çiçəklərin, a çəmən! Bir gözəl dəstə gül tutaydım mən.* A.Şaiq. *Burda məclis quraq, gözəl çəməndir; Hər tərəf nərgizdir, tər yasəməndir.* M.Rahim. // İnsanın ruhunu oxşayan, ruhuna ləzzət verən, xoşa

gələn. *Gözəl səs. Gözəl avaz ilə oxumaq. – Hava gözəl və işıq idi.* Qantəmir. *Faytonçunun səmimi, yanıqlı bir səslə oxuduğu gözəl mahnı birdən xırp kəsildi.* M.Hüseyn. *..Bülbül öz gözəl nəğməsini oxumaqda idi.* M.Rzaquluzadə. // Estetik zövq verən.

3. Məharətli, öz sənətinin ustası olan, çox yaxşı, əla. *Gözəl usta. – Kərim baba özünü bir də doğruldaraq: – Mənim atam da gözəl ovçu idi, – dedi.* A.Şaiq.

4. Müsbət keyfiyyətlərə və ya xassələrə malik olan, hər cəhətdən yaxşı olan, necə lazımsa elə. *Gözəl adam. Gözəl oğul. Gözəl xasiyyət. – Dedim ki, gözəl xələf olarsan; Bir ailəyi şərəf olarsan.* M.Ə.Sabir. [Süleyman:] *..Əsgər çox gözəl oğlandır. Çox ağıllı, yaraşıqlı və çox da şüurlu oğlandır.* Ü.Hacıbəyov. [Səməd:] *Mən bir görüm, axı elə gözəl insan birdən niyə bu qədər pozulub?* İ.Hüseynov.

5. Əlverişli, yararlı, yaxşı. [Mirzə:] *Ağa, məsləhətiniz çox gözəldir, ömrünüz uzun olsun, siz həmişə mənim uşaqlarımın qeydinə qalıbsınız.* Ə.Haqverdiyev.

6. *zərf* Yaxşı, əla. *Gözəl çalmaq. Gözəl danışmaq. – Əgər əhli-ruhsan, sözün gözəl de.* Aşıq Ələsgər. [Dilbər:] *Sizi isə, Gülüş, indi mən çox gözəl anlayıram.* C.Cabbarlı. *Hələ Zəki adlandırdıqları gənc nə qədər gözəl oxuyurdu.* S.Hüseyn.

◊ **Çox gözəl** – çox yaxşı, yaxşı oldu, razıyam (təsdiq ifadəsi). [Sultan bəy:] *Çox gözəl, qızım, bilirsən nə var?* Ü.Hacıbəyov. [Səba xanım:] *Çox gözəl, bunu* [min qızılı] *siz özünüz verirsiniz. Bəs Toğrul nə verəcəkdir?..* M.S.Ordubadi.

**GÖZƏLCƏ** *sif.* Çox gözəl, çox yaxşı, qəşəngcə. *Gözəlcə uşaq. Gözəlcə bağça. Gözəlcə səsi var. – Bir sərin, saf səhər, gözəlcə hava; Bürünüb yamyaşıl çəmən, səhra!* A.Şaiq. // Zərf mənasında. *Gözəlcə geyinmək. Gözəlcə nitq dedi. – Soba otağı qızdırmışdı, elektrik ətrafı gözəlcə işıqlandırmışdı.* Çəmənzəminli. *Şıxəli xanın sirdaşlarından Çərkəz adlı birisi Abbasqulu ağagilin evinə gözəlcə bələd imiş.* Ə.Sadıq.

**GÖZƏLCƏSİNƏ** *zərf* Çox gözəl, çox yaxşı. *Mən Məşədi Kazımağanı gözəlcəsinə anlayırdım.* M.S.Ordubadi.

**GÖZƏLƏMƏ** "Gözələmək"dən *f.is. Sap tikiş, gözələmə, naxış çəkmə və s. üçün işlədilir.*

**GÖZƏLƏMƏK** bax **gözəmək**. *Həvəslə xalça toxuyan gəlinlər .. boz çuvalları gözələyir, kisələri daşa-divara çırpıb tozunu təmizləyirdilər.* M.Hüseyn. *..Hatəm baba .. çuvalların ağzını gözələyirdi.* Ə.Əbülhəsən.

**GÖZƏL-GÖYÇƏK** bax **gözəl** 1-ci mənada. *Gözəl-göyçək qız. Gözəl-göyçək uşaq.* – [Hacı Murad:] *..Bir gözəl-göyçək qız al, gətir qoy evinə..* S.S.Axundov. [Sultan bəy:] *Qudurğan oğlu qudurğan, bir dul xalasının əvəzində gözəl-göyçək qızımı istəyir.* Ü.Hacıbəyov.

**GÖZƏL-GÖZƏL** *sif.* Gözəl (adətən çoxluq bildirir). *Gözəl-gözəl evlər. Gözəl-gözəl şeylər. – Gözəl-gözəl xanımlar əfsərlər ilə qol-qola verib gəzirdilər.* Ə.Haqverdiyev. *Bal arısı dilində; Gözəl-gözəl nəğmələr; Çəmənləri dolaşıb; Gül tozları yığardı.* M.Dilbazi.

**GÖZƏLLƏMƏ** *is. folk.* Gözəli tərənnüm edən aşıq şeir formalarından birinin adı. *Aşıq Ələsgərin gözəlləmələri. – Dilində Vaqifin gözəlləməsi; Yayılmış ətrafa onun zil səsi.* S.Vurğun. *Tahir telli sazını sinəsinə basdı və gözəlləmə çaldı.* M.Hüseyn.

**GÖZƏLLƏNDİRİLMƏ** "Gözəlləndirilmək"dən *f.is.*

**GÖZƏLLƏNDİRİLMƏK** bax **gözəlləşdirmək**.

**GÖZƏLLƏNDİRMƏ** "Gözəlləndirmək"dən *f.is.*

**GÖZƏLLƏNDİRMƏK** *f.* Gözəl etmək, gözəllik vermək, bəzəmək, qəşəngləndirmək. *Evi bəzəyib gözəlləndirmək. Gül dibçəkləri otağı daha da gözəlləndirdi.*

**GÖZƏLLƏNMƏ** "Gözəllənmək"dən *f.is.*

**GÖZƏLLƏNMƏK** bax **gözəlləşmək**.

**GÖZƏLLƏŞDİRİLMƏ** "Gözəlləşdirilmək"dən *f.is.*

**GÖZƏLLƏŞDİRİLMƏK** *məch.* Daha da gözəl edilmək; yaxşılaşdırılmaq.

**GÖZƏLLƏŞDİRMƏ** "Gözəlləşdirmək" *is.*

**GÖZƏLLƏŞDİRMƏK** *f.* Gözəlləndirmək, daha da gözəl etmək. *Yazıq qadın üzünü gözəlləşdirmək üçün, kim bilir, üz-gözünə nə qədər şey sürtmüşdü.* S.Hüseyn. *Gülsə-*

*hərin boyunbağısı ağ sinəsini daha da gözəlləşdirirdi.* Ə.Vəliyev.

**GÖZƏLLƏŞMƏ** "Gözəlləşmək"dən *f.is.*

**GÖZƏLLƏŞMƏK** *f.* Daha da gözəl olmaq; qəşəngləşmək. *Qız böyüdükcə gözəlləşir. – ..Qız o qədər böyümüş və gözəlləşmişdi ki, gərək iki göz olub ona tamaşa eyləyəydi.* E.Sultanov. *Nigar böyüyür, böyüdükcə rəngi ağarır, gözəlləşirdi.* S.Hüseyn. *Züleyxa getdikcə gözəlləşirdi..* C.Cabbarlı. // Daha da yaxşılaşmaq, qəşəngləşmək. *Xətti getdikcə gözəlləşir. Kəndimiz ildən-ilə gözəlləşir.*

**GÖZƏLLİK** *is.* Gözəl adam və ya şeyin halı: qəşənglik, gözəşirinlik. *Mənim tanrım gözəllikdir, sevgidir.* H.Cavid. [Məmmədbağır] *bütün ömrünü qadınların gözəlliklərini ölçməklə keçirmişdi.* S.Hüseyn. *Gülgəz bütün gözəlliyi və cazibədarlığı ilə* [Səmədin] *qarşısında dayanıb, sehrlənmiş kimi yerindən tərpənə bilmirdi.* İ.Hüseynov.

**GÖZƏM** b a x **güzəm**.

**GÖZƏMƏ** "Gözəmək"dən *f.is. Çuvalın gözəməsi.*

**GÖZƏMƏK** *f.* Toxunma şeylərin yırtılmış, deşilmiş yerini yenidən toxumaq, tikmək, yamamaq. *Corabları gözəmək. Torbanı gözəmək. Şalvarın yırtığını gözəmək. – Vadila .. dizi üstünə yığdığı qara atlasdan ibarət bir yığın tikə-paraları bir-birinə gözəməyə başlamışdı..* Ə.Məmmədxanlı.

**GÖZƏŞİRİN** *sif.* Gözə xoş gələn, qanışirin, yapışıqlı, xoşagələn, sevimli. *Gözəşirin uşaq. – Qumar "qəhrəmanları" gözəşirin bir gənci əhatə edib min cür hiylə ilə qumara qoşardılar.* H.Sarabski.

**GÖZƏŞİRİNLİK** *is.* Gözəşirin adamın və ya şeyin xüsusiyyəti; yapışıqlılıq, qanışirinlik, sevimlilik.

**GÖZƏTÇİ** *is.* Qarovulçu, keşikçi, mühafizəçi, bəkçi, baxıcı. *Mağaza gözətçisi. – Osman gözətçidir oyankı dikdə.* H.K.Sanılı. *..Var-gəl edən gözətçinin ayaq səsləri aydınca eşidilirdi, ağır çəkmələrin dabanlarındakı nallar daş səkiyə sürtülürdü.* İ.Hüseynov. ◻ **Üstünə (üstündə) gözətçi qoymaq** – birini nəzarət altında saxlamaq. [Çoban:] *Üstümdə də gözətçi qoyublar, heç yana tərpənə bilmirəm.* Ə.Haqverdiyev.

**GÖZƏTÇİLİK** *is.* Gözətçi vəzifəsi, qarovulçuluq, keşikçilik, bəkçilik. ◻ **Gözətçilik etmək** – 1) üstündə nəzarət etmək, qarovul çəkmək; 2) himayəçilik etmək, baxmaq. *Mənə nəmli kamerada gözətçilik edəndə sən; Bu mərhumun əlləriylə xilas oldum mən həbsdən.* B.Vahabzadə.

**GÖZƏTLƏMƏ** 1. "Gözətləmək"dən *f.is.*

2. *is.* Gözlənilən şey, ümid. *Rüxsarənin gözətləməsi doğru çıxdı.* S.Rəhimov.

**GÖZƏTLƏMƏK** *f. dan.* 1. B a x **gözləmək**. [Şölə xanım:] *Xacə Məsud, çıx çölə, gözətlə;* M.F.Axundzadə. *Xeyli gözətlədi. Gəldi dalandar*; *Dayanmadan söylədi belə təlaşlı.* M.Rahim.

2. Qarovul çəkmək, baxmaq.

**GÖZƏTLƏNMƏ** "Gözətlənmək"dən *f.is.*

**GÖZƏTLƏNMƏK** b a x **gözlənmək**.

**GÖZƏTMƏ** "Gözətmək"dən *f.is.*

**GÖZƏTMƏK** *qəd.* b a x **gözləmək**. *Guya ki, əlində idi canı; Daim gözədirdi ol zamanı.* Füzuli. *Yar küsdü, Kişvəri, imdi fəna mülkün gözət.* Kişvəri.

**GÖZƏYARI** *zərf* Təxmini, təqribi, çəkmədən və ya ölçmədən gözlə müəyyən edilərək. *Məsafəni gözəyarı təyin etmək. – Borunun sürətinə zənlə baxıb şagirdlərinin işinə gözəyarı qiymət qoyan usta .. razı halda gülümsəyirdi.* M.Hüseyn.

**GÖZGÖRƏ** b a x **gözgörəsi**. *Ovçu ovun düz görə; Düz dolana, düz görə; Mən yara neylədim ki; Atdı məni gözgörə.* (Bayatı). *Dil bağladım bir dilbərə; Yıxdı evimi gözgörə.* Q.Zakir.

**GÖZGÖRƏSİ** *zərf* Göz görə-görə, açıq-açığına, aşkarda, açıq-aşkar. [Ələmdar:] *Yoxsa görün günün-günorta çağında adam da .. belə gözgörəsi özünü soydurarmı?* S.Rəhimov. *İndi isə bəy həyasızlığına salıb, gözgörəsi, əməlli-başlı evlənirdi.* Mir Cəlal. *Mənə gözgörəsi zülm eləyirsiniz, baba.* İ.Hüseynov.

**GÖZGÖRƏTİ** *dan.* b a x **gözgörəsi**.

**GÖZ-GÖZ** *sif.* və *zərf* 1. Çoxlu gözləri, dəlikləri olan; deşik-deşik. ◻ **Göz-göz etmək** – çoxlu dəliklər açmaq, deşik-deşik etmək. *Güllə ilə nişangahı göz-göz etmək.* **Göz-göz olmaq** – deşik-deşik olmaq, çoxlu dəliklər əmələ gəlmək. *Su gəldi, eşil, dağlar;*

*Ömürdür beş il, dağlar; Səndə düşmən izi var; Göz-göz ol, deşil, dağlar.* (Bayatı).

2. Üzərində dairə şəklində gülləri, naxışları olan. *Göz-göz parça.*

◊ **Göz-göz eləmək** – fürsət tapıb bir iş görmək. *Haqnəzər yenə də göz-göz eləyib, daşı kənara atdı..* (Nağıl).

**GÖZ-GÖZƏ** *zərf* 1. Üzbəüz, üz-üzə, qabaq-qabağa, qarşı-qarşıya. *..Məni nahar yeməyinə saxlamaq istədisə də, mən casuslarla göz-gözə oturub nahar etmək istəmədim.* M.S.Ordubadi. *Kamal təyyarəni döndərib faşist quzğunu ilə üz-üzə, göz-gözə gəlməyi qət etmişdi.* M.Rzaquluzadə.

2. *məc.* Aşkar, açıq-aydın, açıq-açığına. *Dəhənin dilbərimin çeşməyi-heyvan dedilər*; *Kim inanar bu sözə, göz-gözə böhtan dedilər.* S.Ə.Şirvani.

◊ **Göz-gözə vuraraq (vurub)** – xəlvəti, gizlincə, başqaları görmədən. *İki gündən bir Tutu su gətirmək bəhanəsilə bulağa gedir, göz-gözə vuraraq adamlardan oğurlanıb birbaş Mürsəlin yanına gəlir.* Ə.Vəliyev.

**GÖZQAMAŞDIRAN, GÖZQAMAŞDIRICI** *sif.* 1. Çox parlaq, baxmaq mümkün olmayan, gur, çox güclü. *Gözqamaşdırıcı işıq. Gözqamaşdırıcı qığılcım.*

2. *məc.* Valehedici, çox təsirli. *Gözqamaşdırıcı gözəllik.*

**GÖZQAMAŞDIRICILIQ** *is.* Gözqamaşdırıcı şeyin xassəsi, keyfiyyəti, gücü.

**GÖZ-QAŞ** *top.* Gözlər və qaşlar bir yerdə. *Göz-qaşı qara qız. – Dağların başı qardır*; *Üstündə daşı vardır; Burdan keçən gözəlin*; *Əcəb göz-qaşı vardır.* (Bayatı). [Qurban:] *Mən kimdən əskiyəm? Bu mənim qəddü qamətim, bu mənim göz-qaşım.* Ə.Haqverdiyev. □ **Göz-qaş atmaq** – b a x **göz-qaş etmək (eləmək)**. *Hər gün bir* “*afətə*” *göz-qaş atdı o; Mənsəbin gücünə at oynatdı o..* B.Vahabzadə. **Göz-qaş etmək (eləmək)** – göz və qaşlarının hərəkətilə işarə etmək, bildirmək, xəbər vermək. [Nazlı:] *Bizdə belədir. Elə ki oğlan ürəyinə yatdı, əvvəlcə ona göz-qaş elə.* Ə.Məmmədxanlı. [Rəşid:] *Anam mənə göz-qaş eləyib, çardağın dalına çağırdı.* İ.Hüseynov. **Göz-qaşını oynatmaq** – gözlərini, qaşlarını, üz əzələlərini tərpədərək ədabazlıq etmək, oyun çıxartmaq.

**GÖZ-QULAQ: göz-qulaq olmaq** – muğayat olmaq, nəzarət etmək, baxmaq, gözdən qoymamaq. *Uşaqdan göz-qulaq ol.* – [Hacı Murad:] *Sənin* [işin] *odur ki, göz-qulaq olasan, o nökər şeydən-zaddan oğurlamasın.* S.S.Axundov. [Qurban:] *Yaz ki, Anaxanımın, Məmişin gözlərindən mənim əvəzində öpsün və onlardan göz-qulaq olsun.* A.Şaiq. [Professor:] *Elədir,* [fotoqrafın] *üstündə göz-qulaq olmalıyıq.* Q.İlkin. **Göz(də)-qulaqda olmaq** – bütün diqqətilə baxmaq, ayıq olmaq, gözdən qaçırmamaq. [Pəri:] *İndi mən gərək həmişə gözdə-qulaqda olam.* Ə.Məmmədxanlı. *Teymur həmişə gözdə-qulaqda olur, elə bil nə isə axtarırdı.* H.Seyidbəyli.

**GÖZLƏMƏ** 1. “Gözləmək”dən *f.is.*

◊ **Gözləmə otağı (salonu, zalı)** – sərnişinlərin qatarı, avtobusu və s.-ni gözləmələri üçün ayrılmış otaq (salon, zal). *Gözləmə otağı çox soyuq idi.* S.Rəhimov. // Qəbula gələn şəxslərin oturub gözlədikləri otaq. [Qaçay] *Gözləmə otağındakı enli skamyada uzandı.* İ.Məlikzadə.

2. İki və ya bir neçə adam arasında təyin edilmiş görüş. *Onların dördü də öz yerində durmuşdu, yenə də gözləmələri var idi.* M.S.Ordubadi.

3. Arzu, istək, həsrət, ümid, intizar. *Dərd məni almadımı? Döşəyə salmadımı? Çox gözləməm var idi; Gözümdə qalmadımı?* (Bayatı). [Kərbəlayı Rəcəb:] *Xanım, doğrudur, ömür keçir, gün keçir, ancaq mənim bir gözləməm var.* N.Vəzirov.

**GÖZLƏMƏK** *f.* Bir şeyin və ya bir adamın intizarını çəkmək, intizarında olmaq. *Qatarı gözləmək. Məktub gözləmək. Yoldaşlarını gözləmək. Qonaqları gözləmək.* – *Şeyx tək otaqda .. təbibsiz, dərmansız ömrünün axır saatını gözləyirdi.* Ə.Haqverdiyev. *Vaqif çıxanda qapıda Mədinəyə rast gəldi, axşamdan orada durub gözləyirmiş.* Çəmənzəminli. *Şükür artıq gözləyə bilmədi.* S.Hüseyn.

2. Qorumaq, qeydinə qalmaq, qayğı çəkmək, muğayat olmaq. *Özünü qatardan gözlə. Uşağı soyuqdəymədən gözləmək.* – [Alacəhrə] *..qoz ləpəsini dimdiklərkən həmişə*

*ayaqlarını halqanın içinə düşməkdən gözləyər.* S.S.Axundov.

3. Bir şeyin ümidində olmaq, arzusunda olmaq, əldə etməyə çalışmaq. *Mükafat gözləmək. Mərhəmət gözləmək. Şad xəbərlər gözləmək.* – [Qoruqçu] *gətirdiyi xəbərə görə ənam gözləyirdi.* "Koroğlu". *İxtiyar qadın Şirəlinin öz fikrindən tezliklə daşınacağını gözləyirdi.* M.Hüseyn.

4. Ehtimal etmək, ümid etmək, düşünmək. *Biz gözləyirdik ki, o, yaxşı işçi olacaq. Ata oğlan gözləyirdi, amma qız oldu. Gözlədiklərimiz doğru çıxdı.*

5. Ciddi surətdə riayət etmək, yerinə yetirmək. *Qayda-qanunu gözləmək. Əmək intizamını gözləmək.* – *Dəftərxanada Mirzənin hörmətini gözlərdilər.* Ə.Haqverdiyev. *Mədəd isə üst-başına fikir verən, təmizlik və səliqə gözləyən adamdır.* Ə.Vəliyev.

**gözləyə-gözləyə** *zərf* Gözləyərək, intizarını çəkərək. *Uşaq anasını gözlər-gözləyə yuxuya getdi.* ☐ **Gözləyə-gözləyə qalmaq** – gözlədiyi, intizarında olduğu, həsrətini çəkdiyi adam gəlməmək, gözləməsi nəticəsiz qalmaq. *Sizə müştaq durur Bağdad elləri; Gözləyə-gözləyə qalıb yolları.* M.P.Vaqif. *Biçarə məhəllə adamı da gözləyə-gözləyə qaldı.* N.Nərimanov. *Çoxlu evli getdi, çoxlu nişanlı; Gözləyə-gözləyə qaldı gəlin, qız.* H.Arif.

**GÖZLƏNƏN** b a x **gözlənilən**. *Ürəklər çırpınaraq, gözlənən gün yetişdi.* R.Rza.

**GÖZLƏNİLƏN** *sif.* Baş verəcəyi, olacağı, törəyəcəyi qabaqcadan nəzərdə tutulan, təsadüfi olmayan. *Gözlənilən cavab.* – *Ceyran düzü adlanan yerdə böyük xərclər hesabına başa gəlmiş yeni quyuların heç biri gözlənilən nəticəni verməmişdi.* M.Hüseyn. // İntizarı çəkilən. *Gözlənilən adam.* – *Qış gecəsi uzun olur. Yenə də səhər; Gecikmişdir gözlənilən bir qonaq kimi.* S.Vurğun.

**GÖZLƏNİLMƏ** "Gözlənilmək"dən *f.is.*

**GÖZLƏNİLMƏDƏN** *zərf* Gözlənilmədiyi halda, birdən, qəflətdən, xəbərsiz, qabaqcadan nəzərdə tutulmadan. *Gözlənilmədən rastlaşma.* – *Çovutma bir güllə gözlənilmədən; Yapışır alnıma, yıxılıram mən.* S.Vurğun. *Qəflətən Möhsün müəllim xəstələndi və gözlənilmədən bu pak insan torpağa getdi.* S.Rəhimov. *Sultan stulda yayxanaraq gözlənilmədən qəhqəhə çəkdi.* İ.Hüseynov.

**GÖZLƏNİLMƏK** *məch.* 1. Olacağı təxmin edilmək, nəzərdə tutulmaq, olacağına, baş verəcəyinə inanılmaq. *Axşam yağış gözlənilir.*

2. Ciddi riayət edilmək, yerinə yetirilmək. *Qayda-qanun lazımınca gözlənilmir.* – *Kolonda yeriş intizamı gözlənilmirdi.* Ə.Əbülhəsən.

**GÖZLƏNİLMƏYƏN** b a x **gözlənilməz**. *Gözlənilməyən təsadüf. Gözlənilməyən xəbər.* – *Bir-iki gün yatdıqdan sonra məlum oldu ki, xəstəliyi ciddidir və gözlənilməyən nəticələr verə bilər.* B.Talıblı.

**GÖZLƏNİLMƏZ** *sif.* Gözlənilmədən baş verən, xəbərsiz, nagahani, əvvəlcədən nəzərdə tutulmayan. *Gözlənilməz təsadüf.* – *Günlərin birində Turab gözlənilməz bir hadisənin şahidi oldu.* M.Hüseyn. *Qəmərlə Gülyanaq üçün Xanpərinin bu vədə gəlməsi gözlənilməz* (z.) *idi.* Ə.Vəliyev. *..Gözlənilməz bir hadisə bizim bu qızğın nəşəli ovumuzu yarımçıq qoydu.* M.Rzaquluzadə.

**GÖZLƏNİLMƏZLİK** *is.* 1. Birdən; gözlənilmədən baş vermə: nagahanilik. *Gəlişin gözlənilməzliyi. Cavabın gözlənilməzliyi. Nəticənin gözlənilməzliyi.*

2. Gözlənilməz hadisə, iş; ehtimal.

**GÖZLƏNMƏK** b a x **gözlənilmək** 1-ci mənada. *Həmədan qazısı və xətibin Bağdaddan Həmədana gəlməsi gözlənir.* M.S.Ordubadi. *Dağlar arasından keçdikcə hər addımda oğru, soyğunçu gözlənirdi.* Mir Cəlal.

**GÖZLƏNMƏYƏN** b a x **gözlənilməyən**. *Hakim ağzını yuxarı tutub, kişinin cır səsinə və ..gözlənməyən hünərinə şaqqıltı ilə gülməyə başladı.* Çəmənzəminli.

**GÖZLƏNMƏZ** b a x **gözlənilməz**. *Gözlənməz vəziyyət.* – *Kərimov gözlənməz halda sözünü dəyişdirib dedi..* H.Seyidbəyli.

**GÖZLƏŞMƏ** "Gözləşmək"dən *f.is.* *Tanışlığın ən ilk mərhələsi üçün təbii olan gözləşmə artır, bir-birinə yaxın oturanlar arasında isə söhbət başlayırdı.* Ə.Əbülhəsən.

**GÖZLƏŞMƏK** *qarş.* 1. Başqalarına hiss etdirmədən bir-birinə baxaraq göz vurmaq, gözlə işarə etmək. *Bir-birilə gözləşmək.* – *Bəylər himləşib gözləşirlər.* Ü.Hacıbəyov.

..*Onlar bir-birilə bic-bic gözləşirdilər.* S.Rəhimov.

2. Bir-birinin gözünün içinə baxmaq, gözünü dikmək. *Ana və bala gözləşdilər.* – [İsfəndiyar] *hərəkətsiz qalıb məstan pişiklə xeyli müddət gözləşdi.* M.Hüseyn.

**GÖZLƏTMƏ** "Gözlətmək"dən *f.is.*

**GÖZLƏTMƏK** *icb.* Gözləməyə məcbur etmək və ya səbəb olmaq. *Qapını açmayıb bayırda gözlətmək.* – *Bir saat soyuq eyvanda gözlətdikdən sonra xan* [Hacı Məlikməmmədi] *çağırtdırdı.* Çəmənzəminli. [Qız:] *Bağışla, səni çox gözlətdim.* M.Hüseyn.

**GÖZLÜ** *sif.* Gözü olan, görən. *Şəfa tapıb qurtarmasın azardan*; *Heç gözlülər onun dərdin görməsin.* Aşıq Ələsgər. [Həmədanlı tacir:] *Gözlülər arasında işığa möhtac korlar var..* Çəmənzəminli.

**...gözlü** – 1) rəqəmlərə qoşularaq, bir şeyin neçə gözdən (bölmədən) ibarət olduğunu bildirir. Məs.: *üçgözlü mənzil;* 2) gözləri (9-cu mənada), bölmələri olan; qəfəsəli. Məs.: *üçgözlü şkaf.*

**GÖZLÜK** *is.* 1. Bir şeyi daha yaxşı görmək və ya gözü qorumaq üçün gözə taxılan şüşə alət: çeşmək, eynək. *Qara gözlük taxmaq.* – *Mən gözlük qoyuram, gözlərim çox zəifdir, amma yoldaşlarımın gözləri çox salamatdı.* C.Məmmədquluzadə. [Kişi] *gözlərinə qara rəngli bir gözlük taxırdı.* S.Hüseyn.

2. Otağın havasını dəyişmək üçün pəncərənin açılıb-bağlanan bir gözü. *Gözlüyün şüşəsi sınmışdır.*

**GÖZLÜKÇÜ** *is.* Gözlük qayıran usta; eynəkçi, çeşməkçi.

**GÖZLÜKLÜ** *sif.* 1. Gözündə gözlük olan, gözlük taxmış: eynəkli, çeşməkli. *Gözlüklü qadın. Gözlüklü müəllim.* – *Gözlüklü qoca kitabları vərəqlədikcə toz qalxırdı.* Çəmənzəminli.

2. B a x **gözlüklü**. *Gözlüklü qapı.*

3. Gözlüyü (2-ci mənada) olan. *Gözlüklü pəncərə.*

◊ **Gözlüklü ilan** *zool.* – Afrikada və Orta Asiyada yaşayan, boynunun ardında gözlüyə oxşar dairələr olan iri, zəhərli ilan.

**GÖZLÜKSÜZ** 1. *sif.* Gözlüyü olmayan, gözlük taxmamış; eynəksiz, çeşməksiz.

2. *zərf* Gözlük olmadan, gözlük taxmadan; eynəksiz, çeşməksiz. *Gözlüksüz oxuya bilmirəm.*

**GÖZMUNCUĞU** *is.* Bədnəzərdən, gözəgəlmədən qorunmaq üçün taxılan ağxallı, qara muncuq. *Boynuna gözmuncuğu taxmaq.* – *Ağ qoçların boyunlarından ara-sıra gözmuncuğu və yaşıl meşindən tikilmiş içi dualı üçkünc pitik asardılar.* H.Sarabski. *İncə xanım çox qısqanır bizim yaman nəzərlərdən; Boynundakı ipək sapa gözmuncuğu taxır hərdən.* S.Vurğun. *Gözmuncuğu bağladı; Kəhərin birçəyinə.* R.Rza.

**GÖZMUNCUQLU** *sif.* Gözmuncuğu taxmış, gözmuncuğu olan. *Gözmuncuqlu uşaq.*

**GÖZOTU** *is. bot.* Çəmənliklərdə bitən çiçəkli bir ot bitkisi.

**GÖZSÜZ** *sif.* Gözü görməyən, kor. *Gözsüz qoca.* // İs. mənasında. *Bir həqiqətdir, iştə gözsüzlər; Kor olur, nuri-həqqi görməzlər.* H.Cavid. ..*Siz o zavallı gözsüzü xəstəxanaya aparırsınız, yaxud oradan gətirirsiniz.* S.Hüseyn. // Zərf mənasında. *Dağdərəni dolannam; Dərya kimi bulannam; Gözlərim sənə qurban; Mən gözsüz də dolannam.* (Bayatı).

**GÖZSÜZLÜK** *is.* Gözü görməyən adamın halı; korluq. *Gözsüzlük pis dərddir.* – |Məsmə:] [Ərimgil] *gözsüzlük bədbəxtliyini, korluq fəlakətini özləri üçün bir nemət hesab edirdilər.* S.Hüseyn.

**GÖZUCU** *zərf* Gözünün ucu ilə; quşbaxışı, ötəri. *Gözucu baxmaq. Gözucu süzmək.* – *Qurbani gözucu onları gördü.* "Qurbani". *Vaqif geyinib otaqdan çıxdı və yenə gözucu arvadını süzdü.* Çəmənzəminli. *Gözucu qıza diqqət eləyən Surxay .. heyran olurdu.* İ.Əfəndiyev.

**GÖZÜAC** b a x **acgöz**. *Gözüac uşaq.*

**GÖZÜACLIQ** b a x **acgözlük**.

**GÖZÜAÇIQ** b a x **açıqgöz**. *Gözüaçıq adam.* – *İnmirə məhəlləsinin camaatı gözüaçıq camaat idi.* N.Nərimanov. [Əmirxan Hidayətə:] *Məni bağışla, anan səndən gözüaçıqdır.* B.Bayramov.

**GÖZÜAÇIQLIQ** b a x **açıqgözlülük**. *Usta bu oğlanın gözüaçıqlığını qiymətləndirərək*: – *Sən haqlısan,* – *dedi.* Ə.Sadıq.

**GÖZÜBAĞLI** *sif.* və *zərf* 1. Gözləri bağlanmış, sarınmış halda (olan). *Əsiri gözübağlı gətirdilər.*

2. *məc.* Heç bir şeydən xəbəri olmayan, bilikcə, zehni inkişafca, mədəniyyətcə geri qalmış (*gözüaçıq* əksi). *Gözübağlı qalmaq.* – [Ataşa] *elə gəlirdi ki, Mürsəl gözübağlı, biliksiz bir kənd uşağıdır.* Ə.Vəliyev. [Vahid:] *Anam-atam bu vaxtadək məni, demək olar ki, gözübağlı saxlayıblar..* İ.Hüseynov.

**GÖZÜBAĞLICA** *sif.* və *zərf* Gözü bağlı olduğu halda, gözlərini yumaraq; gözüyumulu. *Təzə pristav kəndlilər üçün gözübağlıca misalında idi.* Ə.Vəliyev. // b a x **gözübağlı**.

**GÖZÜBAĞLICALIQ** b a x **gözübağlılıq**.

**GÖZÜBAĞLILIQ** *is.* Heç bir şeydən xəbəri olmama, bilikcə, inkişafca, mədəniyyətcə gerilik (*gözüaçıqlıq* əksi).

**GÖZÜDAR** b a x **dargöz**.

**GÖZÜDARLIQ** b a x **dargözlük**.

**GÖZÜDOYMAZ** *sif.* Heç şeydən gözü doymayan; tamahkar, acgöz. *Gözüdoymaz adam.*

**GÖZÜDOYMAZLIQ** *is.* Heç şeydən gözü doymama; tamahkarlıq, acgözlük.

**GÖZÜİTİ** b a x **itigöz(lü)**.

**GÖZÜİTİLİK** b a x **itigözlülük**.

**GÖZÜKÖLGƏLİ** *sif.* və *zərf* Birinin yanında eybi, qüsuru, nöqsanı olan, dili qısa olan. *Gözükölgəli adam.* – [Leylək] *..ağasının müqabilində gözükölgəli olmamağa çalışırdı.* S.Rəhimov. *Kəngərli verdiyi sözə əməl eləmədiyi üçün Mirzə Cəmilin yanında gözükölgəli idi.* Ə.Vəliyev. *Kim bilir, bu şayiədən sonra bəlkə Səmədin üstünə ayaq alan, onu gözükölgəli eləməyə çalışan başqa adamlar da vardı.* İ.Hüseynov.

**GÖZÜKÖLGƏLİLİK** *is.* Gözükölgəli adamın halı; diliqısalıq, eyiblilik, qüsurluluq, nöqsanlılıq.

**GÖZÜQIPIQ** *sif.* 1. Gözləri tam açıla bilməyən, gözləri yarıyumulu olan. // Kirpiklərini tez-tez döyən, gözlərini tez-tez qırpan.

2. *məc.* Hər şeydən qorxan, səksənən, diksinən; qorxaq, cəsarətsiz. [Dəmir:] *Xofludu, – dedi. – Yetim olub, gözüqıpıq olub. Caynağına keçirtdiyi şeyi cəmi-aləm tökülsə də, onnan ala bilməz.* İ.Məlikzadə.

**GÖZÜQIPIQLIQ** *is.* 1. Gözlərin tam açıla bilməməsi, yarıyumulu olması. // Kirpiklərini tez-tez qırpma xasiyyəti.

2. *məc.* Hər şeydən qorxma, səksənmə, diksinmə; qorxaqlıq, ağciyərlik.

**GÖZÜQIRPIQ** b a x **gözüqıpıq**. *Gördün gözüqırpıq, sən də ol gözüqırpıq.* (Ata. sözü).

**GÖZÜQIRPIQLIQ** b a x **gözüqıpıqlıq**.

**GÖZÜMÇIXDI: gözümçıxdıya salmaq** – yerli-yersiz, haqlı-haqsız danlamaq, töhmət etmək, incitmək, əziyyət vermək. *Uşağı gözümçıxdıya salmaq. – Bu Pası da yazığı lap gözümçıxdıya salıbdır.* S.Rəhimov. [Ramazan] *hər zaman Tahiri danlamağa, gözümçıxdıya salmağa bəhanə axtaracaq və öz xoşu ilə işdən boyun qaçırıb, kəndlərinə qayıtmağına səbəb olacaqdır.* M.Hüseyn. [Sərvinaz Şahpəriyə:] *Hümmət sənin fitvanla neçələrini gözümçıxdıya saldı, .. nə bilim, tutdurdu.* B.Bayramov.

**GÖZÜTOX** *sif.* Heç bir şeydə tamahı olmayan, aza qane olan, tamahkar olmayan (*acgöz* əksi). *Gözütox adam.*

**GÖZÜTOXLUQ** *is.* Gözütox adamın xasiyyəti (*acgözlük* əksi).

**GÖZÜYAŞLI** *sif.* Gözləri yaşarmış olan, gözlərindən yaş axan; ağlar. *Gözüyaşlı uşaq. // Zərf mənasında.* Daim ağlayan adam haqqında. *Biçarə Məşədi Əsgər indi üç gün idi ki, gözüyaşlı .. anasına balalarının əhvalına alışırdı.* S.M.Qənizadə. [Dərviş:] *Gözüyaşlı, ciyəri atəşli ocağın qırağında qaldım.* A.Divanbəyoğlu. *Qoşun keçib getdi. Arxasınca da bir sürü uşaq və gözüyaşlı qadınlar toz qopararaq yüyürürdü*(*lər*). Çəmənzəminli.

**GÖZÜYAŞLILIQ** *is.* Gözüyaşlı adamın hal və vəziyyəti.

**GÖZÜYUMUQ** b a x **gözüyumulu**.

**GÖZÜYUMUQLUQ** b a x **gözüyumululuq**.

**GÖZÜYUMULU** *sif.* və *zərf* 1. Gözləri yumulu, gözləri bağlı. *Gözüyumulu xəstə.* – [Bahar:] *Yaxşı, bəs gözüyumulu oturum?* Ə.Haqverdiyev.

2. *məc.* Kor-koruna, düşünmədən, heç bir şeydən xəbərsiz. [Ağabəyim:] *Kiri, ay dayə, bəxtinin qədrini bilməmisən, dünyaya gözüyumulu gəlib, gözüyumulu da gedəcəksən!..* Çəmənzəminli. *Məşədi Heydər qardaşı kimi*

*Səməd dayıya ürəkdən inanıb, dalınca gözüyumulu gedənlərdən idi.* B.Talıblı.

3. *məc.* Heç bir çətinlik çəkmədən, çox asanca, asanlıqla. *Məsələni gözüyumulu həll etmək.*

**GÖZÜYUMULULUQ** *is.* Heç bir şeydən xəbəri olmama; xəbərsizlik.

**GÖZYAŞARDAN, GÖZYAŞARDICI** *sif.* Gözdən yaş axmasına səbəb olan, gözü yaşardan. *Gözyaşardıcı qazlar.*

**GÖZYAŞARDICILIQ** *is.* Gözyaşardıcı şeyin xassəsi. *Qazın gözyaşardıcılıq xüsusiyyəti.*

**GÖZYORUCU** *sif.* Yeknəsəqliyi, rənglərinin uyğunsuzluğu və s.-yə görə gözü yoran, çox baxmaq mümkün olmayan. *Gözyorucu boz səhra.*

**GÖZYORUCULUQ** *is.* Gözü yoran şeyin xassəsi; gözü yorma.

**GUMB** *təql.* İçiboş bir şeyi vurduqda çıxan səs.

**GUMBULDAMA** "Gumbuldamaq"dan *f.is.*

**GUMBULDAMAQ** *f.* Gumbultu səsi çıxarmaq, gumb eləmək. *Çəllək yerə düşüb gumbuldadı. – Qalxan gumbuldayar, şəmşirlər oynar.* Aşıq Abdulla.

**GUMBULDATMA** "Gumbuldatmaq"dan *f.is.*

**GUMBULDATMAQ** *f.* Gumbultu səsi çıxarmasına səbəb və ya vasitə olmaq. *Ləyəni yerə salıb gumbuldatmaq. Ayaqları ilə döşəməni gumbuldatmaq.* // Eyni mənada nağara, təbil və s. haqqında. *..Dəfçi cuşa gəlib, var gücü ilə dəfini gumbuldadırdı.* M.Hüseyn.

**GUMBULTU** *təql.* Ağır bir şey düşdükdə, yaxud bir şeyə dəydikdə çıxan çox bərk, boğuq səs. *Gecədən xeyli keçmiş bacadan gumbultu ilə bir şey içəri düşdü.* S.S.Axundov. *Ağaclar gumbultu ilə qatarın hər iki tərəfində yerə düşdü.* Q.İlkin. // Təbil, nağara, dəf və b. zərbli musiqi alətləri çalınarkən çıxan səs. *Sinclərin amansız cingiltisi, təbillərin müdhiş gumbultusu göyə yüksəlir.* Ə.Məmmədxanlı. // b a x **gurultu** 1-ci mənada. *..Uzaqlardan arabir top mərmilərinin gumbultusu eşidilirdi.* M.Hüseyn.

**GUM-GUM** *təql.* Bir şey düşərək bir yerə dəydikdə hasil olan boğuq səs. *Gum-gum gumbuldamaq. – ..Yağmur alaçığın keçələrini gum-gum qamçılayırdı.* A.Şaiq.

**GUMUR-GUMUR** b a x **gum-gum**. *Gumur-gumur gumurlanmaq.*

**GUMURLANMA** "Gumurlanmaq"dan *f.is.*

**GUMURLANMAQ** *f.* Gumur-gumur səs çıxartmaq. *Qoç Koroğlu naləsindən; Dağlar gumur-gumurlanır.* "Koroğlu".

**GUP** *təql.* Yuxarıdan düşən ağır şeyin çıxardığı səs. □ **Ürəyi gup eləmək** – ansızın pis bir hadisədən, xəbərdən qorxmaq, ürəyi düşmək. [Mozalan bəy:] *Ürəyim əvvəl bir gup elədi.* Ə.Haqverdiyev. *Əsədin ürəyi gup eləyib döyünürdü.* B.Talıblı.

**GUP-GUP** *təql.* 1. Ayağın yerə tez-tez dəyməsindən hasil olan səs. *Bir fincan çay içər-içməz pilləkənləri gup-gup başıaşağı endim.* A.Şaiq.

2. Ürək döyüntüsünün səsi. *Ürəyi gup-gup döyünür. – Gup-gup döyünüb darıldı bağrım!* M.Ə.Sabir.

**GUPPAGUP** b a x **gup-gup**. *Ürəyi guppagup döyünür.*

**GUPPULDAMA** "Guppuldamaq"dan *f.is.*

**GUPPULDAMAQ** *f.* Guppultu səsi çıxarmaq.

**GUPPULDATMA** "Guppuldatmaq"dan *f.is.*

**GUPPULDATMAQ** *icb.* Guppultu səsi çıxarmasına səbəb olmaq. *Çaydanı yerə salıb guppuldatmaq.*

**GUPPULTU** *is.* 1. Gup-gup səsi. *Eşitdilər birdən at hənirtisi; Silah şaqqıltısı, guppultu səsi.* H.K.Sanılı. *Kompressor stansiyasından gələn yeknəsəq guppultunun arası kəsilmirdi.* M.Hüseyn.

2. *məc.* Həyəcan, əndişə mənasında. [Rzaquluxan:] *İki gündür ki, ürəyimdə bir guppultu vardır.* M.S.Ordubadi.

**GUPSAMA** "Gupsamaq"dan *f.is.*

**GUPSAMAQ** *f.* Birdən şiddətlə vurmaq, ilişdirmək. *Nəriman .. daşı var gücü ilə Robertin başına gupsadı..* Mir Cəlal.

**GUR** *sif.* 1. Güclü, qüvvətli, şiddətli. *Günəşin gur şüaları. – Ocağı gur* (z.) *qaladı; Günortaya hazır oldu çığırtma.* R.Rza. *Üfüqdən, buludlar arasından meşənin üzərinə alov rəngində gur şüalar çilənirdi.* İ.Hüseynov. // Bərk. *Ocaq gur* (z.) *yanır.* // Qızğın. *Gur alver gedir.*

2. Bol və qüvvətli, güclü, coşqun. *Gur çay. Gur çeşmə. – Sərin göllər, dərin çaylar keç-*

*mişəm; Bulaqların gur suyundan içmişəm.* Ə.Cavad.

3. Güclü, qalın. [Anatolunun] *gur səsindən pəncərələrin şüşələri cingildədi.* S.Vəliyev.

4. Qalın, sıx. [Xədicənin] *..gur saçları nəzər-diqqəti cəlb edirdi.* İ.Hüseynov. *Qaşqanın gur yalı doğrudan da dəniz kimi ləpələnirdi.* Q.İlkin.

5. Çox adam olan, qələbəlik, səs-küylü; gediş-gəliş, hərəkət çox olan, izdihamlı. *Gur bazar. Gur şəhər.*

**gur-gur** *zərf* 1) gurultu ilə, bol və güclü çıxan və ya axan suyun çıxardığı səs haqqında. *Çay gur-gur axır;* 2) alışaraq, şiddətlə. *Ocaq gur-gur yanır.*

◊ **Gur-gur guruldamaq** *məc.* – şöhrəti aləmə yayılmaq, məşhur olmaq, məşhurlaşmaq. *Ağır toplar kimi gur-gur gurulda; Daim döyüşkən ol, daim qıvraq ol!* M.Müşfiq.

**GURHAGUR** *zərf* 1. Şiddətlə, gurultu ilə. *Mart ayının əvvəlləri olmasına baxmayaraq, dəmir soba gurhagur yanırdı.* Ə.Vəliyev.

2. Gurultu ilə, bərk səs çıxararaq. *Bir para evlərdə uşaqların atası çaxmaqlı tüfəngi doldurub gurhagur ilə güllə atardı..* H.Sarabski. [Mələk] *..sənəyi bulağa söykədi, su gurhagur sənəyə doldu.* A.Divanbəyoğlu.

**GURLAMA** "Gurlamaq"dan *f.is.*

**GURLAMAQ** *f.* 1. Bərkdən səslənmək, gurultu qoparmaq, guruldamaq. *Hiddət ilə ruzigar gurlar; Qar parçaları səmaya firlar.* A.Şaiq. // Eyni mənada odlu silahlar haqqında. *Minomyotlar gurladı. Uzaqvuran toplar aramsız gurlayırdı.* // Eyni mənada gurultulu səs çıxaran çalğı alətləri haqqında. *Təbil gurladı. – Şeypurlar gurladı, ov bitdi.* Çəmənzəminli. [Qacar:] *Gurlasın dağlarda şeypurun səsi; Sabah alınmalı Şuşa qələsi!* S.Vurğun.

2. Qalın və güclü səs çıxarmaq, bu cür səslə danışmaq. *Qoca gurladı.* – [Ayrım qızının] *gurlayan* (f.sif.) *səsini hər kəs eşitsə idi, onun bir kişi olduğuna inanardı.* A.Şaiq. // Bərk səslənmək. *Bu suallar birər-birər Dəmirqayanın qulağında gurlayırdı.* H.Nəzərli.

3. *məc.* Güclü bir qüvvə ilə başlamaq, qopmaq. *Pəncərədən izdihama tamaşa edən xanımlar, qızlar 1825-ci ildə baş vermiş dekabristlər üsyanının yeni bir qüvvətlə gurlayacağından qorxub tir-tir əsirdilər.* M.Hüseyn.

**GURLANMA** "Gurlanmaq"dan *f.is.*

**GURLANMAQ** *f.* Şiddətlənmək, güclənmək. *Ocaq daha da gurlandı.*

**GURLAŞMA** "Gurlaşmaq"dan *f.is.*

**GURLAŞMAQ** *f.* 1. Daha da gurultulu olmaq, əvvəlkindən gur səslənmək. *Səsi daha da gurlaşırdı.*

2. Şiddətlənmək, artmaq, güclənmək. *Ocaq daha da gurlaşdı. Sel getdikcə gurlaşırdı.*

**GURLAYICI** *sif.* Gurultu səsi çıxaran, gurlayan.

**GURP** *təql.* Ağır bir şey düşdükdə çıxan səs.

◊ **Ürəyi gurp eləmək** – b a x **ürəyi gup eləmək** ("**gup**"da).

**GURPADAN** *zərf* Guppultu ilə, birdən, nagahani. *Gurpadan düşmək.*

**GURSAÇ(LI)** *sif.* Saçı gur olan, qalınsaç. *Gursaçlı qız.*

**GURSAÇ(LI)LIQ** *is.* Qalınsaç(lı)lıq.

**GURSƏS(Lİ)** *sif.* Səsi gur olan, gur səs çıxaran. *Gursəs*(*li*) *kişi.*

**GURSƏS(Lİ)LİK** *is.* Səsi gur olma.

**GURŞAD** *sif.* Çox bərk və sürətlə yağan. *..Gurşad yağmur ehtiyatsız yolçuları islanmış cücəyə döndərir.* M.Rzaquluzadə. // *İs.* Gur yağış, şiddətli yağış. *Dəli dağın ətəklərində sel və gurşaddan sonra göllər, gölməçələr əmələ gəlirdi.* S.Rəhimov.

**GURTAGURT** *təql.* Ocaqda, sobada odun, kömür, qaz yanarkən çıxan səs. *Ocaq gurtagurt saldı.*

**GURULDAYICI** *sif.* Gurultu salan, gurlayan, gur-gur edən.

◊ **Guruldayıcı qaz** *kim.* – hidrogenin oksigenlə qarışığından alınan partlayıcı qaz.

**GURULDAMA** "Guruldamaq"dan *f.is.*

**GURULDAMAQ** b a x **gurlamaq**. *Yağmasa da guruldayır.* (Məsəl). *Dərin darısqal dibində dərənin; Rəd kimi guruldayır baltalar.* A.Səhhət. *Külək daha da şiddətlənir, yerə sərilmiş Dilşadın üzərində guruldayaraq şahidi olduğu faciəni xəbər verirdi.* T.Ş.Simurq.

**GURULDATMA** "Guruldatmaq"dan *f.is.*

**GURULDATMAQ** *icb.* Guruldamasına səbəb olmaq. [Tahir] *..öz məharətini göstərmək*

*üçün bir neçə dəfə motoru guruldatdı...* M.Hüseyn.

**GURULTU** *is.* 1. Bir şeyin hərəkətindən və ya düşməsindən hasil olan çox bərk qarışıq səs. – [Məlikməmməd] *sübhə yavuq gördü bir gurultu, bir nərilti gəlir ki, yer zəlzələ eləyir.* Çəmənzəminli. *Sel gurultu ilə alaçığın içindən axıb gedirdi.* A.Şaiq.

2. Qarışıqlıq, çaxnaşma, hay-küy. *Küçədə böyük bir gurultu vardı.* S.Hüseyn. *Mühakimə, şəhəri titrədən xariqüladə gurultular ilə başladı.* M.S.Ordubadi.

◊ **Gurultuya vermək** – günahı olmayan bir adamın məhvinə səbəb olmaq, bada vermək. **Gurultuya getmək** – günahı olmadan məhv olmaq, bada getmək.

**GURULTULU** *sif.* 1. Gurultusu olan, çox səs salan, gurultu salan. *Yağış nə qədər gurultulu* (z.) *yağsa, o qədər sonra hava xoş və aydın olur..* A.Divanbəyoğlu. *Səndə gurultulu bir çağlayan var; Bu dönməz çağlayan durmadan axar.* M.Müşfiq. ◻ **Gurultulu alqış(lar)** – uzun sürən, sürəkli alqış(lar). *Oğlan və qızların sevinc və səsləri, gurultulu alqışları salonu bürüdü.* H.Seyidbəyli.

2. Səs-küy çox olan, səs-küylü, gediş-gəliş çox olan, izdihamlı. *Gurultulu gecə. Gurultulu meydan.* – [Nərgiz:] *Mən əvvəllər təsəvvürümə gətirə bilmirdim ki, gurultulu şəhər həyatından sonra kənddə necə dolanacam.* İ.Şıxlı.

3. *məc.* Həddindən artıq təntənəli, bəzəkli, dəbdəbəli, təmtəraqlı. *Gurultulu sözlər.*

**GURULTULULUQ** *is.* Gurultu qoparan adam və ya şeyin halı.

**GURULTU-NƏRİLTİ** *is.* Çox bərk səs-küy, gurultu. *Çayın tərpətdiyi qayalar toqquşur, gurultu-nərilti qoparırdı.* B.Bayramov.

**GURULTU-PATILTI** bax **gurultu-nərilti**. *Günlərin birində qonşumgildən gurultu-patıltı eşitdim.* S.Rüstəm.

**GURUPPULTU** bax **guppultu**. *..Orada bir belə məqalə var idi*: "*Milləti-islamiyyənin inhitatı*", *yəni* "*müsəlmanların yuxarıdan guruppultu ilə aşağı düşməyi*". C.Məmmədquluzadə.

**GUŞ** [*fars.*] *klas.* Qulaq. *Barmağında xatəm, guşində tənə; Gireh-gireh zülfün tökə gərdənə.* M.P.Vaqif. ◻ **Guş etmək** *klas.* – qulaq asmaq. [Zeyd:] *Harun, guş et, bir dəm; Leylayə mən bəndəm.* Ü.Hacıbəyov.

**GUŞƏ** *is.* [*fars.*] 1. Künc, bucaq. *Otağın guşəsi.* – *Onlar uçuq toyuq hinini palçıqlayır və həyətin bir guşəsinə yapılmış təzəkləri qalağa yığırdılar.* M.İbrahimov. [Səlim] *başqa bir guşəyə yeridi.* B.Bayramov. // Tin, künc. *Binanın guşəsi.* ◻ **Guşə bağlamaq** – iki divarın kəsişdiyi yeri hörmək, tini tikmək. *Baş tərəfdəki guşə bağlayan ustanın oxumağı ayrı bir zövq verirdi.* S.Rəhimov.

2. Hissə, tərəf, cəhət. *Axşam vaxtları Xansaraq şəhərinin məğrib tərəfi behiştin bir guşəsini yada salır.* C.Məmmədquluzadə.

3. Qələbəlik, izdihamlı yerdən uzaq olan sakit yer. [Molla İbrahimxəlil:] *Məgər mən öz ixtiyarımla belə abadanlıqdan xaric, xəlvət guşəyə özümü çəkmişəm?.* M.F.Axundzadə. [Rza:] *Mən yavaşca evdən çıxıb Ulduzla həyətin xəlvət bir guşəsinə çəkilmişdim.* M.İbrahimov.

4. Böyük bir şeyin içində müəyyən məqsəd üçün ayrılmış xüsusi yer, hissə. *Qəzetin tənqid guşəsi.* – *Bax, bu ikinci otaqdakı pərdəli guşələri görürsünüz, burada səs verəcəksiniz.* Mir Cəlal.

5. *mus.* Melodiyanın, nəğmənin ən təsirli hissəsi, dəsgahlarda bitkin və aydın melodik quruluşa malik vokal-instrumental epizod. *Xanəndələr onun guşələrini əzbər edib məclislərdə oxuyurdular.* Ə.Haqverdiyev. *Muğam – hər guşəsi sirli, soraqlı; Yola bənzəyir.* B.Vahabzadə.

◊ **Qırmızı guşə** – siyasi və mədəni maarif işləri üçün ayrılmış, kitab, plakat və s. ilə təchiz olunmuş otaq, yer. *Zavodun qırmızı guşəsi.*

**GUŞƏBƏND** *is.* [*fars.*] *köhn.* Bir şeyin, ya tikilinin guşələrini birləşdirməkdən ötrü metal və ya başqa materialları birləşdirməkdən ötrü metal üçbucaq şəklində bənd; künyə.

**GUŞƏDAŞI** *is.* 1. Tikilərkən binanın tinlərinə qoyulan və başqa bütün daşların qoyulması üçün əsas olan daş. *Guşədaşı yerdə qalmaz.* (Ata. sözü).

2. *məc. kit.* Əsas, başlıca ideya, çıxış nöqtəsi.

**GUŞƏNİŞİN** *is.* [*fars.*] Cəmiyyətdən, adamlardan qaçan adam; asket, zahid. ◻ **Guşənişin olmaq** – bir yerdə qapanıb

qalmaq, evdən bayıra çıxmamaq. [Şah:] *Mən ona Mazandaran hökumətini vermişəm, gedib əyləşib orada, olub guşənişin.* Ə.Haqverdiyev. // Sif. mənasında. *Guşənişin bir adamdır; Xeyrə, şərə yaramaz.* M.Müşfiq.

**GUŞƏNİŞİNLİK** *is.* Guşənişin adamın halı; asketlik, zahidlik.

**GUVULDAMA** "Guvuldamaq"dan *f.is.*

**GUVULDAMAQ** *f.* Guvultu səsi çıxarmaq, uğuldamaq. *Budur şimal yeli qopub guvuldar; Sürükləyib buludları vıyıldar.* A.Səhhət. *Daşlar səslənir, qalın meşələr guvuldayır.* S.Rəhimov.

**GUVULTU** *is.* Geniş sahəni əhatə edən dəhşətli səs; uğultu.

**GUYA, GUYA Kİ** *bağl.* Sanki, elə bil. *Guya bilmirsən. – ..Axurun içində guya ki, fənə bürünmüş bir şey naçalnikin gözünə sataşdı.* C.Məmmədquluzadə. *Mirzə Mustafa cəsarətlə gəlib onun qabağında əyləşdi, guya ki, heç naməhrəm deyil.* E.Sultanov. [Yusif:] *..Guya Gülgəz bacı Gülbənizə deyib ki, mənim ər evində oturmağım axırsız şeydir.* İ.Hüseynov.

**GÜBRƏ** *is.* Bitkiləri daha yaxşı qidalandırmaq və məhsuldarlığını artırmaq üçün torpağa qatılan üzvi və ya qeyri-üzvi maddə. *Üzvi gübrə. Mədən gübrəsi. Torpağa gübrə vermək.*

**GÜBRƏLƏMƏ** "Gübrələmək"dən *f.is.*

**GÜBRƏLƏMƏK** *f.* Torpağa gübrə vermək. *Tarlanı gübrələmək.*

**GÜBRƏLƏNDİRİLMƏ** "Gübrələndirilmək"dən *f.is.*

**GÜBRƏLƏNDİRİLMƏK** *məch.* Gübrə vurdurulmaq, gübrə səpdirilmək.

**GÜBRƏLƏNDİRMƏ** "Gübrələndirmək"dən *f.is.*

**GÜBRƏLƏNDİRMƏK** *icb.* Gübrə vurmaq, gübrə vermək.

**GÜBRƏLƏNMƏ** "Gübrələnmək"dən *f.is.*

**GÜBRƏLƏNMƏK** *məch.* Gübrə vurulmaq, gübrə verilmək. *Tarla gübrələndi.*

**GÜBRƏLƏTMƏ** "Gübrələtmək"dən *f.is.*

**GÜBRƏLƏTMƏK** *icb.* Gübrə verdirmək, gübrə vurdurmaq. *Sahəni gübrələtmək.*

**GÜBRƏLİ** *sif.* Gübrəsi olan, gübrə verilmiş, gübrələnmiş. *Gübrəli torpaq.*

**GÜBRƏSƏPƏN** *sif. k.t.* Torpağı gübrələyən; gübrəverən. *Gübrəsəpən maşın.* // İs. mənasında. *Gübrəsəpəni təmir etmək.*

**GÜBRƏSİZ** *sif.* Gübrə verilməmiş, gübrəsi olmayan. *Gübrəsiz torpaq.*

**GÜC** *is.* 1. Canlıların əzələlərini gərginləşdirmə vasitəsilə fiziki hərəkətlər etmə qabiliyyəti; insanın (heyvanın) fiziki enerjisi, qüvvəsi; qüvvə. *Görsün mən dəlinin indi gücünü.* "Koroğlu". Gücünə *bax, şələni bağla*. (Ata. sözü). □ **Güc almaq** – güclənmək, qüvvətlənmək. *Şəhriyaram, güc alıb, qüvvət alıb eşqimdən; Mən huma tək uçaram, sinəsi suzan gedərəm.* Şəhriyar. **Güc etmək (eləmək)** – b a x **güc vermək** 1-ci mənada. *Fələk zülmün gec elər; Gec olsa da, güc elər.* (Bayatı). **Güc gəlmək** – bir işi güc işlədərək görmək. **Güc vermək** – 1) bir şeyi qaldırmaq və ya yerindən tərpətmək üçün fiziki qüvvə sərf etmək; 2) gördüyü bir işi daha da gücləndirmək. *Danışığa güc vermək. – Güc verir, eylə ki, məcmuə yazanlar gələnə..* M.S.Ordubadi. **Güc vurmaq** – b a x **güc vermək** 1-ci mənada. [Şərəbanı:] *Sən güc ver!* C.Cabbarlı. **Gücdən düşmək** – 1) gücünü, qüvvətini itirmək, gücsüzləşmək; 2) etibarını, qüvvəsini itirmək. **Gücdən salmaq** – gücsüz etmək, taqətdən salmaq. *Xəstəlik onu gücdən saldı.* **Gücə salmaq** – 1) zor işlətməklə bir şeyi əldə etmək, yaxud əldə etməyə çalışmaq, zorla bir şeyə məcbur etmək. *Gücə salıb əlindən almaq. – Qalalar, ay qalalar; Laçın orda balalar; Laçın balasın verməz; Bəlkə gücə salalar.* (Bayatı); 2) gücü çatmayan bir şeyə güc vuraraq bədənin bir yerini zədələmək. *Belini gücə salmaq.* **Gücü çatmaq** – bir işi görə bilməyə qüvvəsi çatmaq, qüvvəsi daxilində olmaq; bacarmaq. *Ananın, göz yaşından savayı heç nəyə gücü çatmırdı.* M.Hüseyn. **Gücü düşmək** – b a x **gücü çatmaq**. *İndi deyin görüm, o qüvvətli qolların gücü düşməyən hansı bir kamandır.* M.S.Ordubadi. **Gücü gəldikcə** – bütün gücü ilə, bacardığı qədər, var qüvvəsi ilə. [Eyvaz kişi] *özünü itirmədi, sağ əli ilə sol qoluna dolanan ilanın boğazından tutub gücü gəldikcə çayın içinə atdı.* Ə.Vəliyev.

2. Qüvvət, taqət. *Əlinin gücü yoxdur.* ◻ **Güc gətirmək** – qüvvətlənmək, artmaq, üstünə gəlmək. *Xəstəlik güc gətirdi.* **Gücdən düşmək** – qüvvəti getmək, taqətdən düşmək, zəifləşmək. *Ustanın azarı günü-gündən şiddətlənirdi, bəzən zəifləşib gücdən düşürdü.* Çəmənzəminli.

3. İşgörmə qabiliyyəti, enerji. *Maşının yükqaldırma gücü. Suyun gücü. – El gücü, sel gücü.* (Ata. sözü).

4. Bacarıq, qabiliyyət. *Göstərir aləmə hər işdə bu gün öz gücünü; Kapital sahibinin göylərə çıxmaqda ünü.* M.Müşfiq.

5. Qüdrət, qüvvət. *Dövlətin gücü.* // Təsir qüvvəsi. *Sözün gücü. Dəlillərin gücü.*

6. İnandırma qabiliyyəti, təsir qüvvəsi. *Təbliğatın gücü. Tərbiyənin gücü. – Sənətin gücü onun həyata təsir gücü ilə ölçülməlidir.* S.Rəhimov. *Sözünün gücünü özü də bildi.* B.Vahabzadə.

7. Bir şeyin təzahür dərəcəsi; intensivlik, gərginlik. *Səsin gücü. Küləyin gücü. Partlayışın gücü.*

8. Maddi cəhət, pul. *Ev tikməyə gücüm yoxdur.* ◻ **Gücü çatmaq** – maddi vəziyyəti imkan verməmək, bir işi görmək üçün pulu olmaq. [Veys:] *Beş misqallıq şeyə gücümüz çatmır!* Ə.Əbülhəsən.

9. Üstünlük, qüvvə. ◻ **Güc gəlmək (gətirmək)** – üstün gəlmək, qalib gəlmək. [Axırda qız Məlikməmmədə dedi:] *..Bu devə güc gələ bilməyəcəksən.* (Nağıl). *Bizim Sədəf, Balakişi oğluna güc gəldi.* İ.Əfəndiyev.

10. Hüquqi cəhətdən qüvvəyə malik olma; səlahiyyət. *Müqavilənin gücü.* ◻ **Gücdən düşmək, gücünü itirmək** *hüq.* – qüvvədən düşmək, daha məcburi olmamaq. *Müqavilə gücdən düşdü. Qanun gücünü itirdi.* **Gücə minmək** *hüq.* – qüvvəyə minmək, artıq hamı üçün məcburi olmaq. *Qanun ayın birindən gücə minmişdir.*

11. Yardım, kömək. [Naçalnik:] *Bəy, mən gəlmişəm ki, Nəbini tutam. Bu işdə gərək mənə güc verəsən, mən sənsiz heç iş görə bilmərəm.* "Qaçaq Nəbi".

12. Məhsul yetirmə, göyərtmə qabiliyyəti (torpaq haqqında). *Torpağın gücü. Torpaq gücdən düşüb.*

13. Böyük istehsal qüvvəsinə malik olma; qüvvə. *Fabrikin gücü. Zavod bütün gücü ilə işləyir.*

14. **Gücdür** şəklində – çətindir, zordur. *Gələn çox uzaqda olduğu üçün onun kim olduğunu fərq etmək gücdür.* S.Hüseyn.

15. **Güclə** şəklində *zərf* – zorla, çətinliklə, bütün qüvvəsini toplayaraq. *Güclə yerimək. Güclə danışmaq. – Qalalar, ha qalalar; Qaladan yol salalar; Analar bala verməz; Bəlkə güclə alalar.* (Bayatı). *Tavandan asılmış çırağın fitilini qaldıran olmadığından, otaq güclə işıqlanırdı.* İ.Şıxlı.

16. **Gücünə** şəklində – yiyəlik halda olan isimlərdən və nisbət şəkilçili şəxs əvəzliklərindən sonra gələrək "...köməyi ilə, ...yardımı ilə, ...arxalanaraq" mənasında işlədilir. *Biliyin gücünə...*

**GÜC-BƏLA** *zərf* Çox çətinliklə, böyük əziyyətlə; zorla. *Güc-bəla onları gətirib yola; Deyirəm: – Adıma vurmayın ləkə!* S.Rüstəm. *..Sarı keçi bir günü acgöz-acgöz çox yaman tıxdı, güc-bəla evə döndü.* S.Rəhimov.

**GÜCƏNDİRMƏ** "Gücəndirmək"dən *f.is.*

**GÜCƏNDİRMƏK** *icb.* Gücənməyə, güc sərf etməyə məcbur etmək.

**GÜCƏNMƏ** "Gücənmək"dən *f.is.*

**GÜCƏNMƏK** *f.* 1. Güc sərf etmək, güc vurmaq. *Stolu qaldırmaq üçün gücənmək. – ..Deyib Hacı birdən bərk-bərk gücəndi; Yumruğu Əjdərin ağzına endi.* H.K.Sanılı.

2. *məc.* Cəhd etmək, çox çalışmaq. *Sərdar Rəşid bu son sözümün cavabını vermək üçün xeyli gücəndi.* M.S.Ordubadi.

**GÜCLƏMƏ** "Gücləmək"dən *f.is.*

**GÜCLƏMƏK** bax **gücənmək**. *At çarmıxdan azad olannan sora istədi bir gücləsin, gördü yox, üstündəki can bu canlardan deyil.* (Nağıl).

**GÜCLƏNDİRİCİ** *sif. xüs.* 1. Elektrik cərəyanının gərginliyini və ya gücünü artırmağa məxsus cihaz, qurğu (telefon, radio və s.-də).

2. Bir şeyin qüvvətini artırmaq, bir prosesin gedişini gücləndirmək üçün işlənən xüsusi maddə, preparat.

**GÜCLƏNDİRMƏ** "Gücləndirmək"dən *f.is.*

**GÜCLƏNDİRMƏK** *f.* Gücünü artırmaq, daha güclü etmək; qüvvətləndirmək. *Səsi gücləndirmək. Müdafiəni gücləndirmək.*

*Diqqəti gücləndirmək. – Biz hər şeydən əvvəl ingilis koloniyaçılığı ilə mübarizəni gücləndirməliyik.* M.S.Ordubadi.

**GÜCLƏNMƏ** "Güclənmək"dən *f.is.*

**GÜCLƏNMƏK** *f.* 1. Gücü, qüvvəsi daha da artmaq; qüvvətlənmək. *Qoşun daha da gücləndi.* – [Həsən Paşa dedi:] *Xotkar sağ olsun, Koroğlu bu saat çox güclənib.* "Koroğlu".

2. Şiddəti, gücü artmaq. *Qar güclənir. – Külək get-gedə güclənir, hava qaralırdı.* Ə.Vəliyev. *Yağış get-gedə daha da güclənir.* H.Seyidbəyli.

**GÜCLÜ** *sif.* 1. Fiziki qüvvəsi çox olan, fiziki cəhətdən inkişaf etmiş; qüvvəli (insan və heyvan haqqında). *Güclü adam. Güclü at. – Qollar güclü, qollar gərgin, ağır daşlar; Qaldırılır üfüqlərə.* M.Müşfiq. [Sevinc:] *Bu mübarizədə qalib çıxmaq üçün gərək ağlın iti olsun, qolun da güclü!* Z.Xəlil. // *İs. mənasında.* Güclü, qüvvətli adam. *Sən zəlil ol, eybi yox, qoy güclü çəksin ləzzəti.* M.Ə.Sabir. *Xeyr, bu heç olmaz, güclü gücsüzdən intiqam almaz.* H.Cavid.

2. Möhkəm, dayanıqlı, səbatlı, mətanətli. *Güclü iradə.* – "*Fırlanır*" *sözüylə o güclü insan; Qırdı mövhumatın sərt buzlarını.* B.Vahabzadə.

3. Yaxşı silahlanmış, böyük müdafiə və hücum imkanlarına malik olan. *Güclü ordu.* – [Nüşabə:] *Düşmən həm güclüdür, həm də hiyləgər; Qüvvətlə, hiyləylə qazanır zəfər.* A.Şaiq.

4. Böyük nüfuz qüvvəsi olan; qüdrətli. *Güclü dövlət.*

5. Şiddətli, qüvvətli, bərk. *Güclü isti. Güclü işıq. Güclü ağrı. Güclü şaxta. – Ətraf güclü yağışdan tərtəmiz yuyulmuşdu.* S.Vəliyev. // Böyük, dərin. *Güclü arzu. Güclü hiss. Güclü nifrət.*

6. İstedadlı, bilikli, bacarıqlı, hazırlıqlı. *İndi Bakı neft sənayesi, şöhrəti uzaqlara yayılmış güclü mütəxəssislərə malikdir.* (Qəzetlərdən). // Öz işini yaxşı bilən, yaxşı yerinə yetirən; bacarıqlı, qabiliyyətli. *Güclü tələbə. Güclü üzgüçü. Güclü pianoçu.* // Yaxşı məlumatlı, bilikli. *Ruscadan güclüdür.*

7. Bərk, möhkəm. *Güclü zərbə. – Qapıya güclü bir təpik vurdu.* H.Seyidbəyli.

8. Böyük istehsal imkanlarına və qüvvəsinə malik olan. *Güclü zavod.*

9. Böyük təsir qüvvəsinə malik olan; çox təsirli. *Güclü nitq. Güclü söz.*

10. Uzaqdan eşidilən, çox bərk (səs haqqında). *Güclü partlayış səsləri ətrafı bürüdü, torpaq göyə sovruldu.* S.Vəliyev.

11. Yaxşı məhsul verən, yaxşı məhsul yetirən; bərəkətli, münbit. *Güclü torpaq.* // Yaxşı inkişaf edən, tez böyüyən, tez məhsul verən. *Güclü ağac.*

**GÜCLÜK** *is.*: **güclük çəkmək** – çətinlik çəkmək, səy etmək, çalışmaq. *Uşaq cavab verməkdə güclük çəkirdi.* – [Ceyran:] [Eldar] *məni məşğul etmək üçün söhbət mövzusu bulmaqda güclük çəkirdi.* S.Hüseyn.

**GÜCLÜLÜK** *is.* Güclü adamın, heyvanın və ya şeyin xüsusiyyəti, keyfiyyəti; qüvvətlilik. [Vəzir:] *Teymur ağanın güclülüyündən söz düşdü, hamı bəylər dedi ki, tamam Lənkəranda Teymur ağadan güclü bir kimsənə tapılmaz..* M.F.Axundzadə.

**GÜCÖLÇƏN** b a x **qüvvətölçən**.

**GÜCÖTÜRÜCÜ** *is. xüs.* Gücü bir aqreqatdan başqa bir aqreqata, aqreqatın bir hissəsindən digər hissəsinə ötürmək üçün qayış, val və s.

**GÜCSÜZ** *sif.* 1. Gücü, fiziki qüvvəsi olmayan və ya az olan, fiziki cəhətdən inkişaf etməmiş; qüvvəsiz. *Gücsüz adam.* – [Adil:] *Biz* [atama] *sığınırdıq, onun gücsüz əlindən güc alırdıq.* B.Bayramov. // *İs. mənasında.* Gücsüz, qüvvətsiz adam. [Musa:] *Bir daha gücsüzləri çeynəyib əzməsinlər, artıq anlasınlar, yalnız yaşamaq deyil, yaşatmaq da lazımdır.* H.Cavid.

2. Zəif, qüvvətsiz. *Gücsüz qoşun. Gücsüz külək. Gücsüz səs.*

**GÜCSÜZLÜK** *is.* Gücsüz adam və ya şeyin keyfiyyəti: qüvvətsizlik, zəiflik. [Pərşan Sənubərə:] *And içmək də ağlamaq kimi gücsüzlük, iradəsizlik əlaməti deyilmi?* B.Bayramov.

**GÜCÜRLƏMƏK** *f.* Güclə məcbur etmək.

**GÜDAZ** [*fars.*]: **güdaza vermək** – birinin məhvinə, yoxa çıxmasına, fəlakətə uğramasına səbəb olmaq. [Yasəmən:] *Demədimmi nahaq yerə özünü güdaza verəcəkdir.* S.S.Axundov. *Gözüm su içməyir İlyasdan,*

*düzü; Beləsi güdaza tez verər bizi.* S.Vurğun. **Güdaza getmək** – boş yerə məhv olmaq, yoxa çıxmaq, fəlakətə uğramaq, bədbəxt olmaq. [Qaraş:] *Yoldaşların da güdaza getməyi sən kimi bişüur yoldaşların bərəkətindəndir.* C.Məmmədquluzadə.

**GÜDƏ** *dan.* bax **gödək**.

**GÜDƏBOY(LU)** *dan.* bax **gödəkboy(lu)**. *Bu arvad güdəboy, adətdənkənar yoğun bir adam idi.* Çəmənzəminli.

**GÜDƏLMƏ** "Güdəlmək"dən *f.is.*

**GÜDƏLMƏK** *dan.* bax **gödəlmək**. *Söylə mənə: vəzarəti-milliyəniz düzəldimi? Ya uzun əl, uzun papaq qıssalaşıb güdəldimi?* M.Ə.Sabir.

**GÜDMƏ** "Güdmək"dən *f.is.*

**GÜDMƏK** *f.* 1. Gizlicə birinin dalınca baxmaq, gözdən qoymamaq; gözləmək. *O, yolda adam qoymağa, Qədimin yolunu güdməyə başladı.* S.Rəhimov. *Səni tale günəşim güdməklə; Keçməsin qorxulu vadilərdən.* M.Müşfiq.

2. Qorumaq, mühafizə etmək, gözləmək, qayğısına qalmaq. *Süd bişirdi, səs-səmir yox, heyvangüdən* (f.sif.) *uşaqlar; Bir çalanın ətəyində od qalamış isinir.* A.Şaiq. ◻ **Öz xeyrini (mənfəətini) güdmək** – ancaq öz xeyri (mənfəəti) haqqında düşünmək və buna müvafiq hərəkət etmək.

**GÜDÜK** *is. dan.* Güdmə, güdmək işi. ◻ **Güdükdə durmaq (olmaq)** – dayanıb, gizlənib güdmək. *Mən bağa girib oynayacağam, siz güdükdə olun.* (Nağıl).

**GÜDÜKÇÜ** *is.* Güdən, keşik çəkən adam, gözətçi.

**GÜDÜLMƏ** "Güdülmək"dən *f.is.*

**GÜDÜLMƏK** "Güdmək"dən *məch.*

**GÜHƏR** *klas.* bax **gövhər**. *Yüz elm oxusan axırı avarə qalarsan: Baxmazlar sənin dürlü gühərin var.* M.Ə.Sabir.

**GÜL** *is.* [*fars.*] 1. Çiçək (danışıqda "qızılgül" mənasında da işlənir). *Ağaclar gül açıb. Gül dərmək. – ..Bir dəstə gül olaydım; Asılaydım yaxannan.* (Bayatı). *Bir gül ilə bahar olmaz.* (Ata. sözü). *..Hər gülün, hər çiçəyin öz adı, öz surəti var.* S.Vurğun.

2. Buxara dərisinin üzərindəki incə qıvırcıqlar. *Bu dərinin gülləri çox xırdadır. – Hacı güldü. Börkünü əlinə götürüb onun güllərini yatırmaq üçün əlilə tumarladı.* M.S.Ordubadi. *Həcər papağı oxşadı, gümüşü güllər parıldadı.* S.Rəhimov.

3. Toxunma şeylərin, xalçanın və s.-nin üzərində olan buta və s. *Xalçanın gülləri. Parçanın gülləri qəşəngdir.* [Hamı:] *Ah, nə gözəl parçadır; Gülləri də qonçadır.* Ü.Hacıbəyov.

4. Çörəkdə xırda-xırda yanmış yer; yanıq qabarları. *Çörəyin çoxlu gülü var.* ◻ **Gül vermək** – çörəkdə gül əmələ gəlmək; qabarlanmaq. *Çörək gül verib.*

5. Qızılcanın ən şiddətli anındakı səpgi. *Uşağın bədənini gül basıb.*

6. *bayt.* Qoyun xəstəliklərindən birinin adı. *Qoyuna gül düşdü, qırıldı.*

7. *məc.* Əziz, istəkli, sevimli, sevgili adam. *Biçarə Vamiq oldu avarə öz elindən; Məcnunu sən ayırdın Leyli kimi gülündən* C.Cabbarlı.

8. **Gülüm** şəklində – əziz, istəkli, sevimli bir adama nəvazişli müraciət. *Öylə rənadır, gülüm, sərvi-xuramanın sənin; Kim, görən bir gəz olur, əlbəttə, heyranın sənin.* Füzuli.

9. *məc.* Gözəl, qəşəng, məsum. *Gül kimi uşaq. Gül kimi qız. Gül surət. Gül yanaq. – Mən aşıq gül üzünə; Şeh düşmüş gül üzünə.* Sarı Aşıq.

◊ **Gül açmaq** *məc.* – 1) gözəlləşmək, təravətlənmək, qəşəngləşmək. *Gözəl qız, yaxşı vaxtda; Başladın gül açmağa.* Ə.Cavad; 2) həyata keçmək, rövnəq tapmaq, çiçəklənmək. *Arzuları gül açdı. Əməllər gül açır. –* [Zəhra:] *Ədalət dünyada əlvan gül açsın; Səadət günəşi nurunu saçsın.* M.Rahim. **Gül ağız** *isteh.* – söyüşkən, ağzından pis sözlər çıxan, acıdanışan adam haqqında. [Səkinə Məşədi Ağabanıya:] *Açma mənim gül ağzımı, yoxsa açaram sandığı, tökərəm pambığı.* M.Əliyev. **Gül gülü çağırmaq (səsləmək, dindirmək)** *şair.* – təbiətin, ətraf mənzərənin gözəlliyini ifadə etmək üçün işlədilir. *Çaylar axırdı, hovuzlar fəvvarə vururdu, gül gülü çağırırdı.* Çəmənzəminli. *Fələkdən bac verib, bac alan könlüm; İndi uşaq kimi ağlar səninçün; Gül gülü çağırır, çiçək çiçəyi; Gülər aşiqlərin qönçə diləyi.* M.Müşfiq. **Gül kimi** – çox yaxşı, gözəl. **Gül kimi (tək) açılmaq** – 1) gözəlləş-

mək, qəşəngləşmək. *Uşaq böyüdükcə gül kimi açılır;* 2) sevinmək, ürəyi açılmaq, şadlanmaq. *Mən yanına gəlsəm tutulur ol mahitaban; Gültək açılır yanına əğyar gələndə.* S.Ə.Şirvani. **Gül kimi təmiz** – haqqında heç bir pis söz deyilməmiş; təmiz, məsum. [Şahnigar:] *..O bircə canına and olsun ki, mən gül kimi təmizəm, ay qardaş, heç elə şey olarmı?* İ.Şıxlı. **Gül vaxtı (çağı** və s.) – güllər açan vaxt, ilk bahar, ilk yaz. *Hər yan dedilər ki: – Ey bəlakəş! Gül çağıdır, olmagil müşəvvəş.* Füzuli. *Bu bahar fəslində, gül mövsümündə; Hər kimin ki, ola yarı yanında; Bil ki, bəxtəvərdi tarı yanında.* Q.Zakir. *İndi gül dəmidir, fəsli-bahardır; Hər gülün, çiçəyin bir sirri vardır.* S.Vurğun. *Gül fəsli yetişmişdi.* M.Rzaquluzadə. **Gül yağı** – güldən çəkilib yeyinti sənayesində və ətriyyatda işlədilən xoşiyli yağ. *Üç min gül ləçəyindən; bir gül yarpağının çəkisi qədər; gül yağı çəkirlər.* R.Rza. **Gül yarpağı kimi əsmək (titrəmək)** – qorxudan, həyəcandan, bəzən də soyuqdan titrəmək. *Sürmənin dodaqları gül yarpağı kimi titrəyir, uzun kirpikləri tez-tez qırpınır, gözləri xumarlanırdı.* M.Süleymanov. **Gül(ünü) vurmaq** – bir şeyin ən yaxşısını, yaxud ən siftəsini seçib götürmək. *..Meşinov dönüb Əlyarova dedi: – Sən öl yoldaş silistçi, telefonçu gülünü vurdu.* S.Rəhimov. **Güldən ağır söz** – incidəcək, qəlbə toxunacaq söz. *Nə Şamxal atasının üzünə ağ olmuş, nə də atası ona güldən ağır söz demişdi.* İ.Şıxlı.

**GÜLAB** *is.* [*fars.*] Qızılgül yarpaqlarını distillə etmək yolu ilə alınan ətirli maye, gül suyu. *Gülab çəkmək. Üzünə gülab səpmək. – Ənbər etmiş torpağın adın, suyun ismin gülab.* Füzuli. *Xanım Şəmsiyyə gülab kimi ətir qoxuyurdu.* M.İbrahimov.

**GÜLABDAN, GÜLABZƏN, GÜLABPUŞ** *is.* [*fars.*] Gülab saxlamaq üçün aşağısı girdə, boğazı dar, uzun və qəşəng formalı çini, ya metaldan qab; gülabqabı, gülabsüzən. *..Mərsiyəxan gülabdanı alıb ətirləndi.* Çəmənzəminli. *Dərhal xəlifə .. mis satıllarda şərbət, əlində gülabdan camaat ilə bir yerdə küçəyə çıxardı.* H.Sarabski. *Birdən* [Mehribanın] *gözləri pəncərənin üstündəki gülabpuşa sataşdı.* H.Seyidbəyli.

**GÜLABQABI** bax **gülabdan**.

**GÜLABSÜZƏN** bax **gülabdan**. *..Güldanlar, gülabsüzən, hər cürə qədəh və fincanlar, arvad kəməri, bilərzik, gərdənbənd və sairəni Şahbəy tərifləyə-tərifləyə demişdi..* Ə.Əbülhəsən.

**GÜLBAZ** *is.* [*fars.*] Gül əkməyi, gül becərməyi, ümumiyyətlə, gülü çox sevən adam; çiçəkbaz.

**GÜLBAZLIQ** *is.* Gül əkməyi, gülü becərməyi, ümumiyyətlə, gülü çox sevmə; çiçəkbazlıq. *Əlisa arada söhbət zamanı özünün gülbazlığından ağsaqqal həkimə də söhbət açmış, .. düzəltdiyi güllüyü də ayrıca ona tərifləmişdi.* S.Rəhimov.

**GÜLBƏDƏN(Lİ)** *sif.* və *is.* Klassik Azərbaycan poeziyasında gözəlin epitetlərindən (sifətlərindən) biri. *Neyləmişəm inciyibsən; Yenə, ey gülbədən, məndən.* Q.Zakir.

**GÜLBƏNİZ(Lİ)** bax **gülüzlü**.

**GÜLCAMAL(LI)** [*fars.*] bax **gülüzlü**.

**GÜL-ÇİÇƏK** *top.* Gül və çiçəklər. *Yaz kimi qoynunu açsın gələcək; Yollara gül-çiçək saçsın gələcək!* M.Müşfiq.

**GÜL-ÇİÇƏKLİ(LƏR)** *cəm, bot.* Ağac, kol, otşəkilli müxtəlif bitkilərin daxil olduğu fəsilənin adı. *Gül-çiçəklilər fəsiləsi.*

**GÜLÇÖHRƏ** [*fars.*] bax **gülüzlü**. *Gülçöhrə sənəmlər oldular cəm; Hər bir sənəmin əlində bir şəm.* Füzuli.

**GÜLÇÜ** *is.* 1. Gül əkməklə, gül becərməklə məşğul olan adam. *Gülçü bağban.*

2. Gül satan adam, gül mağazası işçisi.

**GÜLÇÜLÜK** *is.* 1. Gülçünün peşəsi, məşğuliyyəti.

2. Kənd təsərrüfatının gül əkib becərməklə məşğul olan sahəsi. *Gülçülük gəlirli sahədir. Gülçülüyü inkişaf etdirmək. Gülçülük sovxozu.*

**GÜLDAN** *is.* [*fars.*] 1. Dərilmiş gülü qoymaq üçün müxtəlif formalı qab; gülqabı. *Güldana su tökmək.* – [Vaqif] *qarşısındakı mina güldanın içindəki novruzgülü və bənövşələri götürüb qoxuladı.* Çəmənzəminli. *Şair çiçəkləri qoyub güldana; Dedi: – Bir əfsanə yadıma düşdü..* B.Vahabzadə.

2. Dibçək. *Güldanda gül əkmək.*

**GÜLDƏSTƏ** *is.* [*fars.*] Gül, çiçək dəstəsi. *Lalədən, yasəməndən güldəstə bağladılar.*

S.Rüstəm. *Vüqarım ucadır Qoşqar dağından; Güldəstə tutmuşam əməl bağından.* M.Rahim.

**GÜLDƏFNƏ** *is. bot.* Dəfnə ağacı.

**GÜLDÜRMƏ** "Güldürmək"dən *f.is.*

**GÜLDÜRMƏK** *icb.* 1. Gülməsinə səbəb olmaq. *Uşağı güldürmək. Qıdıqlayıb güldürmək.* // Gülüş doğurmaq. *Cəfər əmi öz sözü ilə kimsəni güldürmək istəməmişdi.* H.Nəzərli. *Hələ bir iş də Veyslə yoldaşlarını lap bərk güldürmüşdü.* Ə.Əbülhəsən.

2. *məc.* Sevindirmək, kefini açmaq, şadlandırmaq, şənləndirmək. [Almaz:] *Sağlam gülüş kəndin bütün həyatını yeni bir sevinclə güldürəcəkdir.* C.Cabbarlı. *Cürət! Odur bizi güldürən hər an; Cürətsiz bir həyat məhv olur, inan!* S.Vurğun.

**GÜLDÜRÜCÜ** *sif.* Gülüş doğuran; gülməli, güldürən. *Güldürücü sözlər.*

**GÜLDÜRÜCÜLÜK** *is.* Gülüş əmələ gətirmə, güldürmə.

**GÜLƏBƏTİN** 1. *is.* Qızıl və ya gümüş tellərindən, habelə onlara bənzədilən materiallardan qatışığı olan sap. [Otaqda] *arasıra məxmər, üstünə güləbətin çəkilmiş daraqqabı, saatqabı da nəzəri cəlb edərdi.* H.Sarabski.

2. *sif.* Həmin sapla işlənmiş, üzərinə bəzək vurulmuş. *Güləbətin daraqqabı. Güləbətin araqçın. – Güləbətin köynək, abı nimtənə; Yaxasında qızıl düymə gərəkdir.* M.P.Vaqif.

3. *sif. məc.* Sarı, sarı-qızılı. *Güləbətin saç.*

**GÜLƏBƏTİNLİ** *sif.* Güləbətini olan; güləbətinlə işlənmiş, güləbətinlə bəzədilmiş. *Güləbətinli araqçın.*

**GÜLƏBRİŞİM** *is. bot.* Hündürlüyü bəzən 15-18 metrə çatan ağac.

**GÜLƏNDAM(LI)** b a x **gülbədən(li)**. *Nə xoşdur baş qoymaq bir güləndamın qucağında; Tamaşa eyləmək ol həlqə zülfə ağ buxağında..* M.P.Vaqif. *Aldı mey camini ol yari-güləndam əlinə; Can fəda saqiyə, verdi o gülün cam əlinə.* Ə.Vahid.

**GÜLƏR** *sif.* Şən, mehriban, üzügülər. *Bu sualımdan Məmmədrzanın gülər üzü qara bulud kimi tutuldu.* S.S.Axundov. *Balaca uşaqlar gülər sifətləri ilə biqeyd bağın xiyabanlarında qışqırtı ilə yüyürüşürlər.* Ə.Haqverdiyev.

**GÜLƏRÜZ(LÜ)** *sif.* Şən, mehriban, üzügülər. *Gülərüz qız. – Bağçalarda narın var; Gülərüzlü yarın var.* (Bayatı). *..Vəli uzunboy, gülərüz.. bir oğlan idi.* S.Rəhman.

**GÜLƏŞ**[1] b a x **güləşmə** 2-ci mənada. *Miyandarın işarəsilə Məmməd bəylə Qasım ağa dairənin ortasına güləşə çıxdılar.* Çəmənzəminli. *Kişilər dəm vurur pəhləvanlıqdan; Güləşdən, gülədən, ölümdən, qandan.* S.Vurğun.

**GÜLƏŞ**[2] b a x **gülər**. [Pərinin] *güləş sifəti və hər nə deyiləndə "bəli" deməyi elçilərə çox xoş gəldi.* Çəmənzəminli. *Günorta xəttini aşırdı günəş; Qaçaqlar meşədə, üzləri güləş.* H.K.Sanılı.

**GÜLƏŞÇİ** *is.* İdmanın güləşmə növü ilə məşğul olan idmançı. *Yüngülçəkili güləşçi.*

**GÜLƏŞDİRMƏ** "Güləşdirmək"dən. *f.is.*

**GÜLƏŞDİRMƏK** *icb.* Güləşməyə məcbur etmək, qurşaq tutdurmaq. [Ziba xanım:] *..Xan Qala qırağında bəy uşaqlarını bir-biri ilə güləşdirir.* M.F.Axundzadə.

**GÜLƏŞƏNGİ** *is.* Güləşmə zamanı çalınan hava. *Sanki bir döyüş, bir vuruşma meydanını təsvir edən güləşəngi havası adamları .. yerindən oynadırdı.* Ə.Abasov.

**GÜLƏŞQABAQ(LI)** *sif.* Üzügülər, xoşsifət, mehriban, şən, gülər. *Güləşqabaqlı qız. – Möhlətov istədi bu güləşqabaq oğlanın sözünə soyuqqanlılıqla yanaşsın, məna verməsin, bunu edə bilmədi.* Mir Cəlal.

**GÜLƏŞMƏ** 1. "Güləşmək"dən *f.is.*

2. *idm.* Bir-birinin kürəyini yerə vurmağa çalışan iki nəfərin qurşaq yapışmasından ibarət idman növü. *Güləşmə yarışı.*

**GÜLƏŞMƏK** *f.* Bir-birinin kürəyini yerə vurmağa çalışmaq, qurşaq tutmaq. *Pəhləvanlar güləşdilər.* – [Vəzir:] *Mən cavab verdim ki, əgər mənə yaraşsaydı, bu əlli yaşımda Teymur ağa ilə güləşib onun arxasını yerə qoyardım.* M.F.Axundzadə. *Qabaqda kəndin cavanları güləşir, oynaşır.* C.Cabbarlı.

**GÜLƏŞSİFƏT(Lİ)** b a x **gülərüz(lü)**. *Güləşsifət, ortayaşlı biri .. ayağa qalxıb oturanlara baxdı.* Ə.Vəliyev.

**GÜLƏYƏN** *is.* və *sif.* Çox gülən, gülməyi sevən (adam). *Güləyən qadın. – Çəpərdən üstümə qəfil su atan; O güləyən qızı görəm yuxuda.* M.Araz.

**GÜLGƏZ** *sif. məh.* Qırmızı, al. *Ağ əllərin olub əcaib gülgəz; Qana batıb, yoxsa hənalanıbdır?* M.P.Vaqif. *Şahnisə xanım göz yaşlarını gülgəz dəsmalla silərək .. dedi.* Çəmənzəminli.

**GÜLGÜ** *is.* 1. Gülmə işi; gülüş, gülmə. *Yetər buludlardan vurduğumuz dəm; Bir az da gülgüdən danışsın qələm.* S.Vurğun.

2. Satirik, satira. *Gülgü jurnalı. – Tənqidi əsər istehza, gülgü və məsxərə yolu ilə yazılır.* M.F.Axundzadə. [Səttarxan:] *..Azərbaycan dilində çıxan gülgü məcmuəsinə ayda iki yüz tümən verilməlidir.* M.S.Ordubadi.

**GÜL-GÜL** *sif.* Üzərində gül şəkilləri olan; güllü. *Gül-gül yaylıq.*

**GÜLGÜN** *sif.* [*fars.*] *şair.* Gül rəngli, gül kimi, güllü. *Ey geyib gülgün, damadəm əzmicövlan eyləyən! Hər tərəf cövlan edib, döndükcə yüz qan eyləyən!* Füzuli. [Mərsiyəxan] *arabir susur, alovlu gözləri ilə qadını süzür, gülgün badə ilə qurumuş dodaqlarını isladırdı.* Çəmənzəminli.

**GÜLXANA** *is.* [*fars.*] Qışda bitki, gül, tərəvəz, göyərti yetişdirmək üçün şüşə ilə örtülmüş qızdırılan tikili; istixana. *Gülxanada gül yetişdirmək. Gülxanadan xiyar dərmək.*

**GÜLXƏTMİ** *is. bot.* Əməköməci fəsiləsindən ensizyarpaqlı, iri qəşəng çiçəkləri olan ot-bitki (xalq təbabətində işlədilir).

**GÜLQABI** b a x **güldan**.

**GÜLLƏ** *is.* Top, tüfəng, tapança kimi odlu silahlardan atmaq üçün qurğuşundan düzəldilmiş girdə və uzunsov mərmicik. *Top gülləsi. Tüfəng gülləsi.* – [Heydərqulunun] *kürəyindən dəyən güllə sol ciyərini parçalayaraq böyründən çıxmışdı.* Ə.Sadıq. [Ovçu:] *Niyə tələsdiniz? – dedi, – yaxşı ki güllələriniz dəymədi..* M.Rzaquluzadə. ☐ **Güllə açılmaq** – atəş açılmaq, atılmaq (odlu silah haqqında). *Yarım saat keçmədən soldan bir güllə açıldı.* H.Nəzərli. **Güllə atmaq** – odlu silahdan atmaq, atəş açmaq. *Havaya bir-birinin ardınca üç güllə atdım.* M.Rzaquluzadə. *Səhərə yaxın dalbadal iki güllə atıldı.* İ.Şıxlı. **Güllə boşaltmaq** – bax **güllə atmaq**. *Bir haray yuxuma güllə boşaltdı; Bir duyğu səsiymiş oyadan məni..* M.Araz. **Güllə yağdırmaq, gülləyə basmaq (tutmaq)** – hər tərəfdən çoxlu güllə atmaq. [Nəbi] *qaçaqlar gələn kimi onları gülləyə basıb pərən-pərən edir.* "Qaçaq Nəbi". *..Quldurlar bunları təzədən gülləyə tutdular.* S.S.Axundov.

◊ **Güllə kimi** – 1) çox tez, çox cəld, çox sürətli. *Rəna qapıdan güllə kimi çıxdı.* S.Rəhman. *O, .. dəftəri götürüb güllə kimi pilləkənlə üzüaşağı yüyürür.* Ə.Məmmədxanlı; 2) çox kəskin, çox ağır, çox təsirli. *Paşanın sözü Həsən xana güllə kimi dəydi.* "Koroğlu". *Axırıncı söz güllə kimi Rüstəm kişinin sinəsini dəldi.* M.İbrahimov. **Güllə mənzili** – güllə atılan yerdən güllənin düşdüyü yerə qədər olan məsafə. *Kəndə qədər bir güllə mənzili qalmışdı.* **Güllə sıxmaq** – odlu silahı hədəfə yapışdıraraq vurmaq. *Cibimdə silahım olsaydı, ürəyimə bir güllə sıxardım.* Mir Cəlal. [Ələmdar] *öz gülləsini Müqim bəyin kürəyinə sıxıb ağasının ciyərini çıxartdı.* S.Rəhimov. **Güllə tökmək** – ərinmiş metaldan güllə qayırmaq. **Gülləni gülləyə düzmək** – çoxlu güllə atmaq, ara vermədən atəş açmaq.

**GÜLLƏBARAN** *is.* 1. Çoxlu adamın birlikdə tüfəng atması; çox şiddətli atəş. *İki günlük gülləbarandan sonra kəndlilər Kazımın meyitini çinar ağacından asılmış gördülər.* M.İbrahimov. ☐ **Gülləbaran etmək (eləmək)** – 1) şiddətli atəşə tutmaq. *Düşmənin mühüm bir dəstəsi həmin evi güllələbaran edirdi.* H.Nəzərli; 2) b a x **güllələmək**.

2. Kütləvi qırğın. *Lena güllələbaranı. – Bunun nəticəsində vücuda gələn sürgünlər, güllələbaranlar Bakı fəhlələrinin həyatına da təsirsiz qalmamışdır.* M.S.Ordubadi.

**GÜLLƏÇİ** *is. köhn.* Güllə qayıran və ya satan adam. *Özüm aşıq oldum, oğlum gülləçi.* Aşıq Ələsgər.

**GÜLLƏLƏMƏ** 1. "Güllələmək"dən *f.is.*

2. *is.* Güllələməklə həyata keçirilən ən yüksək cəza; ölüm cəzası; edam. *Güllələmə cəzası.*

**GÜLLƏLƏMƏK** *f.* Güllələmə yolu ilə ölüm cəzasını həyata keçirmək; edam etmək. [Eyvaz:] *Mən əgər naçalnik olsaydım, əvvəl-əvvəl sizin hamınızı divara söykəyib güllələrdim.* C.Cabbarlı.

**GÜLLƏLƏNMƏ** "Güllələnmək"dən *f.is.*

**GÜLLƏLƏNMƏK** *f.* Ən ağır cəza tədbiri olaraq güllə ilə öldürülmək, edam edilmək. *Faşistlər* [dustaqların] *güllələnəcəyi haqqında kənddə divarlara elanlar yapışdırmışdılar.* Ə.Sadıq.

**GÜLLƏLƏŞMƏ** "Güllələşmək"dən *f.is.*

**GÜLLƏLƏŞMƏK** *qarş.* Bir-birinə güllə atmaq; atışmaq. [Qazaqlar] *Nəbigilnən bir gün güllələşdilər.* "Qaçaq Nəbi".

**GÜLLƏNMƏ** "Güllənmək"dən *f.is.*

**GÜLLƏNMƏK** *f.* 1. Gül açmaq, gül açmağa başlamaq; çiçəklənmək. *Yaz mövsümü bülbül dil-dil ötəndə; Bağ-bağçalar nərgizlənir, güllənir.* "Qurbani". *Bahar gəlir, dərələr çiçəklənir, güllənir.* A.Şaiq. [Arvad:] *Oğlum, Firidun, yəqin indi... badam güllənir, hə?..* M.İbrahimov.

2. Güllə bəzədilmək; çiçəklənmək.

3. Xırda qabarlar, güllər əmələ gəlmək (çörəyin üzündə). *Çörək güllənib.*

**GÜLLÜ** *sif.* 1. Çoxlu gül olan, gül bitən, gül əkilmiş; çiçəkli. *..Güllü, bağçalı böyük həyətimizdə bizdən başqa iki əmioğlum da ailəsi ilə yaşayırdı.* S.S.Axundov. *Nə dərdin var, sənin, Gəncə? Şəfalı, güllü bağın var.* Ə.Nəzmi.

2. Gül açmış, gülü olan; çiçəkli. *Güllü ağac.*

3. Üzərində gül şəklində naxışlar olan. *Güllü dəsmal. Güllü don. – Yük üstə güllü xalça; Kim qaldıra, kim aça.* (Bayatı). [Nuriyyə:] *Əynində güllü xalat, başında ağ haşiyəli bənöyüş kəlağayı olan qadın qabağımıza yeriyərək mənə xoşgəldin elədi.* İ.Əfəndiyev. ☐ **Güllü məxmər** – b a x **gülməxmər**.

**GÜLLÜCƏ** *is. bot.* Paxlalılar fəsiləsindən olub dağ rayonlarında, çəmənlərdə, meşələrdə, çay sahillərində bitən yem otu.

**GÜLLÜ-ÇİÇƏKLİ** *sif.* 1. Çoxlu gül, çiçək bitmiş. *Güllü-çiçəkli çəmən. Güllü-çiçəkli bağ.*

2. Üzərində gül-çiçək şəklində naxışları olan. *Güllü-çiçəkli çit.*

**GÜLLÜ-GÜLŞƏNLİ** b a x **güllü-çiçəkli**. *Güllü-gülşənli həyət.*

**GÜLLÜK** *is.* Çoxlu gül əkilmiş və ya gül açmış yer; çiçəklik, gülzar, gülüstan, gülşən. *Güllüyün gülü beşgünlükdür.* (Ata. sözü). *Bülbüllər ötüşür, cəh-cəh vururlar; Güllüklərdə dügün, dərnək qururlar.* H.Cavid.

**GÜLLÜ-NAXIŞLI** *sif.* Üzərində gülü, naxışı olan. *Güllü-naxışlı parça.* – [Səkinə] *bardaş quraraq güllü-naxışlı xalçanın üstündə oturmuşdu.* M.İbrahimov.

**GÜLMƏ** "Gülmək"dən *f.is.*

**GÜLMƏXMƏR** *is.* Nazik ipək üzərində iri gülləri olan və qadın paltarları tikmək üçün işlədilən bahalı parça. *4 metr gülməxmər. // Sif. mənasında.* Həmin parçadan tikilmiş. *Gülməxmər paltar.*

**GÜLMƏK** *f.* 1. Müəyyən bir hiss nəticəsində (məs.: sevindikdə, şənləndikdə, gülməli və ya mənasız bir şey gördükdə), habelə bəzi əsəb sarsıntıları anında xarakterik səslər çıxararaq öz duyğusunu bildirmək (*ağlamaq* əksi). *Zəmani-hicrdə gəh ağlayıb, gəhi gülləm.* S.Ə.Şirvani. *Hamı duyub bu halı, gülüb qaqqıldaşdılar.* S.Vurğun.

2. İstehza etmək, ələ salmaq, masqaraya qoymaq, lağ etmək. *Gülmə qonşuna, gələr başına.* (Ata. sözü). *Qıraqdan baxanlar onun qorxaqlığına gülmüşdülər.* Mir Cəlal.

3. *məc.* Xoş bir xəbərdən, yaxşı bir hadisədən sevinmək, şadlanmaq.

4. *məc.* Sevinc ifadə etmək. *Güldü yarpaq, coşdu irmaq, güllər oynadı.* C.Cabbarlı. *Təbiət gülür, çiçəklər, quşlar .. sevinc içindədirlər.* S.Vəliyev.

**GÜLMƏLİ** *sif.* Gülüş doğuran, gülüşə səbəb olan. *Gülməli söz. – Onun bu görkəmi çox gülməli idi.* H.Nəzərli. *Hər kim o qara zülfə könül versə xətadır; Amma yenə mən bəndəm, əcəb gülməliyəm mən.* Ə.Vahid.

**GÜLMƏŞƏKƏR** *sif.* [əsli *fars.* gülbəşəgər – şəkərli gül, gül mürəbbəsi] *zar. isteh.* Şirin, xoş, xoşagələn. *Atan soğan, anan sarımsaq; Sən hardan oldun gülməşəkər?* (Ata. sözü).

**GÜLMIX** *is.* Xırda mıx.

**GÜLNAR** *is.* [*fars.*] *klas.* Nar ağacının gülü, nar gülü.

**GÜLÖYŞƏ** *sif.* Meyxoş (nar növü). *Dost məni yad eylədi; Bir gülöyşə nar ilə.* (Ata. sözü). *Bağçalarda çiçək açır gülöyşə nar, yasəmən; Qaranquşla bir zamanda qayıdaram kəndə mən.* Ə.Cəmil.

**GÜLPƏRƏST** *is.* və *sif.* [*fars.*] Gül becərməyi, gül yetişdirməyi, ümumiyyətlə gülü sevən (adam). *..Kim Əlisa kimi faydalı, bağpərəst, bağçapərəst, gülpərəst bir adamın adını belə-belə ləkəli şeylərə çəkə bilər?* S.Rəhimov.

**GÜLRƏNG** *sif.* [*fars.*] *klas.* Açıq-qırmızı rəngli, çəhrayı rəngi, gül rəngində olan. *Dur, saqi, gətir badeyi-gülrəngi bu bəzmə; Ver badeyi-gülrənglə bir rəng bu bəzmə.* Raci.

**GÜLRÜX, GÜLRÜXSAR** [*fars.*] *klas.* b a x **gülüzlü**. *Ah vaveyla ki, ol gülrüx pəri yarım degil; Mən ona yar oldum, ol yari-vəfadarım degil.* Xətayi. *Laf urarlar hüsndən hərçənd gülrüxsarlər; Həq bilür, ol ayeyi-rəhmət sənin şənindədir.* Qövsi.

**GÜLSABAH** *is. bot.* Səhər açılıb axşam vaxtı yumulan dekorativ gül; səhərgülü.

**GÜLŞAD** *sif.* Xoşa gələn, ürəkaçan, gözəl mənzərəli. *Gülşad yer.* ◻ **Gülşad olmaq** – şən olmaq, abad olmaq. *Onsuz hünər evi gülşad olmazdı.* S.Vurğun. *Bənna qardaş, nə möhkəmdir qoyduğun təməl! Abad olsun! Gülşad olsun! Yorulmayasan!* Ə.Cəmil.

**GÜLŞƏN** *is.* [*fars.*] Güllük, çiçəklik. *Bu gülşənin yasəməni, sünbülü; Nə bir bağa, nə bostanə düşübdür.* M.V.Vidadi. *Gülşəndə bənövşələr açıldı; Səhralara lalələr saçıldı.* A.Şaiq.

**GÜLÜ** *sif.* 1. Açıq gül rəngli, çəhrayı.

2. Gül şəklində naxışları olan. *Gülü parça.*

**GÜLÜMSƏMƏ** "Gülümsəmək"dən *f.is.*

**GÜLÜMSƏMƏK** *f.* 1. Gülər kimi olmaq, təbəssüm etmək, qımışmaq, dodaqaltı gülmək, öz məmnunluğunu, ya istehzasını təbəssümlə ifadə etmək. *Mənasını anlamadığı bu sözə Aydəmir sadəcə gülümsəyərək kupeyə girdi.* A.Şaiq. *Şəmsiyyə kədərli və fikirli olsa da* [Sərhənglə] *danışarkən gülümsəməyə, şad görünməyə çalışırdı.* M.İbrahimov.

2. *məc.* Adamın üzünə gülmək, fərəh oyatmaq. *Bahar gülümsəyir. Hər yer gülümsəyirdi.*

**GÜLÜMSƏR** *sif.* Gülümsəyən, gülən, təbəssümlü. *Gülümsər göz. – Bir gün acı bir səs o gülümsər üzü sardı.* H.Cavid. *Qızın solğun rəngi, xurmayı saçları, gülümsər qonur gözləri var idi.* Ə.Məmmədxanlı.

**GÜLÜMSƏRCƏSİNƏ** *zərf* Gülümsəyərək, təbəssümlə. *Gülümsərcəsinə cavab vermək. – Qız qara gözləri, uzun kirpikləri arasından gülümsərcəsinə* [dedi].. T.Ş.Simurq.

**GÜLÜMSÜNMƏ** "Gülümsünmək"dən *f.is.*

**GÜLÜMSÜNMƏK** b a x **gülümsəmək**. [Buğac] *ananın munis çöhrəsini göründə gülümsündü.* M.Rzaquluzadə.

**GÜLÜNC** *sif.* və *zərf* 1. Gülməyə səbəb olan, gülməli, gülüş doğuran. // *məc.* Mənasız, qeyri-ciddi. *Ceyrana malik olmaq fikri və hissi mənə çox qəribə, bəlkə gülünc görünürdü.* S.Hüseyn. *Ölüm fikri* [Mələkdən] *uzaqlaşdı, ona gülünc və mənasız göründü.* M.İbrahimov.

2. İstehzaya, masqaraya səbəb olan, istehza doğuran. *Gülünc hərəkət.* // Gülmək obyekti; hamının gülməsi üçün hədəf. *Dəhanın sədəfdir, dişlərin inci; Sən məni eylədin ellər gülüncü.* M.P.Vaqif. [Koxa:] *Mən kənardan uşaq tutub, Cavanşirlər arasında gülünc ola bilmərəm!* S.Rəhimov.

**GÜLÜNCLÜK** *is.* Gülünc olan adam və ya şeyin halı; gülüş doğurma, gülünc olma. *Dəlillərin gülünclüyü. Təklifin gülünclüyü.*

**GÜLÜSTAN** *is.* [*fars.*] Güllük, çiçəklik, gülzar; qızıl güllük. *Ol güli-xəndanı görmək mümkün olsaydı mənə; Səntək, ey bülbül, gülüstanə güzar etməzmidim?* Füzuli. *Zeynəb bu gülüstanı, bu çarqat kimi sərilmiş lalələri və çiçəkləri görcək yorulmağını unudub .. gül yığmağa qaçdı.* S.S.Axundov.

**GÜLÜŞ** *is.* 1. Şadlıq, sevinc, məmnunluq və s. xarakter hisslərin ifadəsi olaraq ağızdan çıxan qırıq-qırıq səslər. *Acı gülüş. Şən gülüş. – Əvvəl* [Ceyranın] *üzündə, danışığında istehzanı andıran bir gülüş vardı.* S.Hüseyn. *Gülün, elə gülün ki; Çatsın qulaqlarıma; Sizin gülüşləriniz.* B.Vahabzadə. // İstehza. "*Molla Nəsrəddin*"*in gülüşü kəskin bir gülüş, öldürücü bir satira idi.* M.İbrahimov. *Mərdan güldü. Onun gülüşü quru, qeyri-təbii çıxdı.* H.Seyidbəyli.

2. Gülmə, şənlənmə, zarafat. *Qədim vaxtlar komediyanı yunanilər gülüş üçün çıxardırlardı.* N.Nərimanov.

3. *məc.* Sevinc, şadlıq, şənlik. *Uca ağaclardakı yarpaqlar büzüşdü, onların gülüşü matəmə döndü.* M.İbrahimov.

**GÜLÜŞMƏ** "Gülüşmək"dən *f.is. Məclisdə bir gülüşmə başladı.* S.Hüseyn. *Camaat arasına gülüşmə və qarışma düşdü.* Qantəmir.

**GÜLÜŞMƏK** *f.* Qarşılıqlı və ya birlikdə gülmək (çoxları haqqında). *Adamlar gülüşdülər. – Uşaqlar içinə düşər gülüşmək; Sənin də acığın tutar, ağlarsan.* M.V.Vidadi. *Qonaqlar gülüşdülər və sonra Kəblə Namazla zarafatlaşmağa başladılar.* Çəmənzəminli.

**GÜLÜZAR** [*fars.* gül və *ər.* üzar] *klas.* bax **gülüzlü**. *Seyri-gülşən et sən, ey gülüzarım.* M.V.Vidadi. *Gər sənin mətləbin gülüzardısa; Artıq sevin gülüzarı görəndə.* Q.Zakir. *Ey könül! Min namə yaz bir gülüzarın eşqinə; Can evindən seyrə çıx bir xoş güzarın eşqinə!* S.Vurğun.

**GÜLÜZLÜ** *sif.* Gözəlin epitetlərindən (sifətlərindən) biri. *Göy üzünü bəzər parlaq ulduzlar; Yer üzünü bəzər gülüzlü qızlar.* H.Cavid.

**GÜLYANAQ(LI)** *is.* və *sif. şair.* Gözəlin epitetlərindən (sifətlərindən) biri. *Gülyanaq qız. – Hər aşiqin ki, sən kimi bir gülyanağı var; Lalə kimi əyandı ki, köksündə dağı var.* S.Ə.Şirvani.

**GÜLZAR** *is.* [*fars.*] *şair.* Çoxlu gül olan yer; gülüstan, çiçəklik, güllük. *Bülbül səbəbsiz olmadı gülzarə aşina.* S.Ə.Şirvani. *Çöllər yuxudan olunca bidar; Min rəng çiçəklə dolur gülzar.* A.Şaiq. *Darıxıb gülzara çıxdığım zaman; Ətrini duyuram güldən-çiçəkdən.* M.Rahim.

**GÜLZARLIQ** bax **gülzar**. *Gülzarlıqla alov arasında uca sədd çəkilmişdi, onu keçmək qabil deyildi.* Çəmənzəminli.

**GÜMAN** *is.* [*fars.*] 1. Lazımınca əsaslanmamış fikir, zənn, ehtimal. *O, gümanının düz çıxmadığını görüb iri, qonur gözlərini geniş açaraq Tərlana baxdı.* M.Hüseyn. ☐ **Güman var ki, güman ki** – ola bilər, mümkündür, ehtimal ki. *Güman var ki, onun biri xəyaldır; Göydən gələn lənətdən bir timsaldır.* A.Səhhət. **Güman etmək (eləmək)** – fikirdə olmaq, ehtimal etmək, zənn etmək. *Bəziləri belə güman eləyirlər ki, müsəlmanların yekə papaqlara məhəbbəti o vədədən başlanıb ki, uşaqlar başlayıblar Quran oxumağa.* C.Məmmədquluzadə. *Nəriman bunun keşikçi olduğunu güman etdi.* Mir Cəlal.

2. Şübhə, şəkk. *Zərrə qədər iman; Dünya qədər güman.* (Ata. sözü). *Mərd igid, könlünə gəlməsin güman; Düşmənlər əlindən çəkərlər aman!* "Koroğlu". ☐ **Gümana düşmək** – şübhəyə düşmək, şəklənmək, şübhə etmək. *Bu yol ilə bütün xəbərlər yayılar, hamını hiddətləndirər, müşavirədə olanlar bir-birindən gümana düşərdilər.* S.Rəhimov. *Kabinetdəki yeniliklərə diqqət yetirən bəzi adamlar cürbəcür gümana düşürdülər.* B.Bayramov. **Gümanı getmək** – şübhələnmək (birindən). *Hacı Kamyab .. o gecə sübhədək şəhəri dolanıb, güman gedən evlərin hamısına toxunub nə Gövhərtacdan, nə Fərmandan bir xəbər tuta bilmədi.* Ə.Haqverdiyev.

3. Ümid, istək, arzu. *Gümanım budur ki, ola ziyadə; Günbəgündən etibarım yanında.* Q.Zakir. *Hamınız dərdi-dilinizi ərz edəsiniz və, inşallah, gümanım bunadır, bu qapıdan naümid qayıtmayasınız.* C.Məmmədquluzadə. ☐ **Gümanı gəlmək** – inanmaq, əmin olmaq, ümid etmək, arxayın olmaq. [Heydər bəy:] *Yaxşı, əgər özünə gümanın gəlirsə, mən razıyam.* M.F.Axundzadə. [Reyhan:] *Amma çarəm yoxdur, gümanım sənə gəlir..* Ə.Məmmədxanlı.

**GÜMRAH**[1] *sif.* Qıvraq, möhkəm, sağlam, qüvvətli. *Yaşına baxmayaraq, çox gümrahdır. – Odun götür, yaxşı yar; Yaxşı doğra, yaxşı yar; İyidi gümrah eylər; Qədirbilən yaxşı yar.* (Bayatı). // Çevik, cəld, diribaş. *Gümrah gənc. – Almurad cəld və gümrah hərəkətlə qalxıb ata mindi.* İ.Əfəndiyev.

**GÜMRAH**[2] *sif.* [*fars.*] *köhn.* Yolunu azmış, doğru yoldan sapmış. [Əjdər:] *Düşərək çöllərə, Allaha pənah; Biz də qaçaqlartək olarıq gümrah!* H.K.Sanılı. ..[İnsanlar] *dinəmi yavıq gələcəklər, ya gümrah olacaqlar.* C.Məmmədquluzadə.

**GÜMRAHLANMA** "Gümrahlanmaq"dan *f.is.*

**GÜMRAHLANMAQ** *qayıd.* Sağlamlaşmaq, qüvvətlənmək, sağlam olmaq, qüvvətə gəlmək. *Xəstə getdikcə gümrahlanır. Dincəldikdən sonra gümrahlanmaq.* – [Hacı Fərəc:] *..İndi günü-gündən gümrahlanıb dönürəm bir cavan oğlana..* N.Vəzirov.

**GÜMRAHLAŞMA** "Gümrahlaşmaq"dan *f.is.*

**GÜMRAHLAŞMAQ** b a x **gümrahlanmaq**. *Budaq indi-indi gümrahlaşırdı ki, birdən yenə də onunku gətirmədi.* Ə.Vəliyev.

**GÜMRAHLIQ** *is.* Gümrah adamın halı; cismən və ruhən sağlamlıq; qıvraqlıq. *Elə adamlar var ki, ruhən ən yorğun dəqiqələrində belə onlarla danışdıqda özündə bir yüngüllük və gümrahlıq duyursan.* İ.Əfəndiyev. *Müridlər də gözlərini bu ağ sinəli, yaşı əllini keçmiş olsa da, gümrahlığını itirməyən kişinin ağzına zilləmişdilər.* İ.Şıxlı.

**GÜMÜŞ** *is.* 1. Parlaq bozumtul-ağ rəngli, kimyəvi element – nəcib metal (zərgərlik və bəzək şeyləri qayırmaq, pul kəsmək və s. üçün işlədilir). ☐ **Gümüş suyuna çəkmək** – adi metalların üstünə gümüş suyu çəkmək, gümüşü rəngləmək. *Qaşıqları gümüş suyuna çəkmək.* **Gümüşə tutmaq** – üstünü gümüşlə örtmək, gümüşlə bəzəmək. *Xəncərin dəstəsini gümüşə tutmaq. // Sif. mənasında.* Gümüşdən qayrılmış. *Gümüş çəngəl. – Yavaş-yavaş gümüş qaşıqlar da stəkanlara dəyib cingildədi.* Çəmənzəminli. *Dəmirqaya üstü zərlə yazılı papirosu gümüş qutudan aldı və oturdu.* H.Nəzərli.

2. *is.* Gümüşdən qayrılmış şeylər; gümüş pul. *Baxdı ki, burada o qədər qızıl, gümüş var, elə bil yeddi padşahın xəzinəsi burdadır.* "Koroğlu". ☐ **Gümüş kağız** – ətri çıxmasın deyə çay, siqaret və s.-nin büküldüyü qurşun kağız.

3. *sif.* b a x **gümüşü**. *Dərələrdən gümüş sular çağlar.* A.Şaiq. *Ay gümüş dalğalarda; Nazlanır gəmi kimi.* N.Rəfibəyli.

**GÜMÜŞCƏ** *is. zool.* Çaylarda yaşayan xırda balıq növü. *Bizim çaylarda gümüşcə adlanan xırda balıqlar da yaşayır. Bu balıqlar suyun üst qatlarında üzən balıqlardandır.* "Zoologiya".

**GÜMÜŞDƏSTƏ** *sif.* Dəstəsi gümüşdən olan, qəbzəsi gümüşdən qayrılmış. *Cəmil dayısının gümüşdəstə xəncərini belinə bağlayıb, yüyürə-yüyürə atlılara qoşuldu.* Ə.Vəliyev.

**GÜMÜŞLƏMƏ** "Gümüşləmək"dən *f.is.*

**GÜMÜŞLƏMƏK** *f.* 1. Üzərinə nazik gümüş məhlulu çəkmək. *Qaşıqları gümüşləmək.*

2. Gümüşlə bəzəmək, gümüşlə işləmək. *Xəncəli işlə, yolla; Üstün gümüşlə, yolla.* (Bayatı).

**GÜMÜŞLƏNMƏ** "Gümüşlənmək"dən *f.is.*

**GÜMÜŞLƏNMƏK** *məch.* Gümüş suyu çəkilmək və ya gümüşlə bəzədilmək. *Bu çəngəllər gümüşlənib.*

**GÜMÜŞLƏTMƏ** "Gümüşlətmək"dən *f.is.*

**GÜMÜŞLƏTMƏK** *f.* Gümüş suyu çəkdirmək və ya gümüşlə bəzədilmək. *Papirosqabını gümüşlətmək.*

**GÜMÜŞLÜ** *sif.* 1. Gümüşlə bəzədilmiş, gümüşlə işlənmiş. *Əllərində sur təsbeh; Gümüşlü buxurdanlar.* Ə.Cavad.

2. Tərkibində gümüş olan. *Gümüşlü metal külçəsi.*

**GÜMÜŞÜ** *sif.* Ağ-bozaçalar parlaq rəngdə olan, rəngi gümüş rəngində olan, gümüş kimi parıldayan. [Nuriyyə:] *..Gümüşü toran içindən bir motosiklin çıxdığını gördüm.* İ.Əfəndiyev. *Buludların parçalandığı oyuqdan ulduzlu fəzaya doğru bir pəncərə açılar-açılmaz .. ayın gümüşü ziyaları həmin pəncərədən yerə yayıldı.* Ə.Məmmədxanlı.

**GÜMÜŞÜLÜK** *is.* Gümüşü rəngdə olan şeyin xüsusiyyəti, gümüş rəngində olma.

**GÜN** *is.* b a x **günəş** 1 və 2-ci mənalarda. *Gün işığı. Gün çıxar, aləm görər.* (Ata. sözü). *Gəldi günortaçağı, gün qızarıb yanırdı.* S.Vurğun. *Gün iki cida boyu qalxmışdı.* Mir Cəlal. ☐ **Gün əyilmək** – axşama yaxın günəş üfüqdən çəkilmək. *Gün lap əyilir, şər qarışır. İnəklər naxırdan gəlir.* "M.N.lətif." **Gün tutulmaq** – günün qabağına başqa bir göy cisminin və ya onun kölgəsinin düşməsi nəticəsində müvəqqəti görünməz olması hadisəsi. *Gözümüz üfüqdədir, açılmır səhərimiz; Bizə düşən səmada gün tutulmuş, ay Allah!* B.Vahabzadə. **Gün vurmaq** – qızğın günəş şüalarının təsirindən beyin mərkəzi zədələnmək. **Gün yağlanmaq (ağarmaq)** – günəş çıxıb, bir az yuxarı qalxmaq. [Qoca:] *Gün ağarmadan çayı keçməliyik.* M.Rzaquluzadə. *..Baxış bəy səhər, gün yağlananda oyandı.* Ə.Abasov.

**GÜN²** *is.* 1. Gecə-gündüzün səhərdən axşama qədərki işıqlı müddəti, günçıxandan günbatana qədərki dövr. *Gün doğuşundan bəllidir.* (Ata. sözü). *Biz baxırıq özgə millətlərə,*

*.. deyirik ki, niyə onlar bazar günlərini tətil eləyirlər, niyə onlar eləsin, biz eləmiyək?* C.Məmmədquluzadə.

2. Yerin öz oxu ətrafında bir dəfə dövr etdiyi (24 saatlıq) müddət; gecə-gündüz. *..İl var bir günə dəyməz; Gün var min aya dəyər.* (Bayatı). *Bu minval ilə üç gün keçdi.* "Koroğlu". ◻ **Bir gün deyil, beş gün deyil** – həmişə, daim. **Biri gün (o birisi gün)** – sabahdan sonrakı gün; sabah yox, o biri gün. **Bu günlərdə** – bu bir neçə gün ərzində, yaxın vaxtlarda. *İnciyib məndən, eşitdim o gözəllər gözəli; Aramız, bəlkə, bu günlərdə, güman var, düzələ.* Ə.Vahid. **Bugünkü gündə** – indi, hazırda. [Qızıl Arslan] *Biz bugünkü gündə islahat işlərinə başladığımız zaman hər addımda Quranla qarşı-qarşıya gəlirik.* M.S.Ordubadi. **Ertəsi gün** – bir gün sonra. **Gün uzunu** – bütün günü, bir günün ərzində. **Gündə bir** – hər gün, tez-tez. [Bahar:] *Özgə kişilər övrətlərini gündə bir döyürlər, amma bu mənə heç bir çırtma da vurmur.* Ə.Haqverdiyev. **Günlərin bir günü** – b a x **günün birində**. [Əsgər:] *Günlərin bir günü, axşam saat doqquzda bazardan gedirdim.* Ü.Hacıbəyov. **Günü axşam etmək (eləmək)** – bütün gününü boş keçirmək, işsiz oturmaq, əbəs yerə gözləyə-gözləyə durmaq. *Qərib günü axşam etdi. Şahsənəm çıxmadı.* "Aşıq Qərib". **Günü bu gün** – elə bu gün, gecikdirmədən, bu gündən o yana qalmayaraq. [Gülnaz:] *Bax, mən daha səbir edə bilmirəm, günü bu gün atama deyəcəyəm.* Ü.Hacıbəyov. **Günü günə satmaq** – gecikdirmək, yubatmaq, yubandırmaq. [Orxanın] *Onsuz da kəndə getmək niyyəti vardı, ancaq günü günə sata-sata qalmışdı.* İ.Məlikzadə. **Günü sabah** – elə sabah, gecikdirmədən, sabahdan sonraya qoymayaraq. *Əgər siz mənə gəlsəniz, günü sabahdan onun talağını verib boşardım.* E.Sultanov. **Günün birində** – bir gün, bir dəfə. *İşçi dostlarına günün birində; Danışdı dərdini aşiğım mənim..* M.Müşfiq. **Günün günortaçağı** – gündüz hava lap işıqkən. [Ələmdar:] *Yoxsa görün günün günortaçağında adam da .. belə göz-görəsi özünü soydurarmı.* S.Rəhimov. **İki gündə (gündən) bir** – b a x **günaşırı**. [Mirzə Həsən:] *Öküzlə iki gündə bir hektar yer əkirsiniz.* Ə.Haqverdiyev.

3. Müəyyən bir ictimai hadisəni qeyd etmək üçün təqvimdə təyin edilmiş gün. *Qələbə günü. Qazmaçı günü. Müəllim günü.*

4. **Gündə** şəklində *zərf* – hər gün, mütəmadiyən. *Gündə bir kərpic düşür; Ömrümün sarayından.* (Bayatı). [Səkinə:] *Mən gündə bir uşaq doğan arvadı bir də qulluğa götürmərəm.* H.Nəzərli. *Gündə Peterburqdan Gorusa möhürlü paket gəlirdi.* S.Rəhimov.

5. **Gündən-günə, günü-gündən** şəklində *zərf* – bir gündə deyil, günlər keçdikcə, tədricən. *Ah, mən gündən-günə bu gözəlləşən; İşıqlı dünyadan necə əl çəkim?* M.Müşfiq. [Yasəmən:] *Gördüyüm odur ki, maşallah, günü-gündən çiçək kimi açılırsan.* S.Rəhman.

6. Vaxt, vaxtilə. *Bir gün bilinər. – Gün oldu şairlər göyə çıxdılar.* Ə.Cavad.

7. *məc.* Həyat, ömür, yaşayış, dolanacaq, güzəran. *Vətəndə günümüz məşəqqət və korluqla keçirdi.* C.Məmmədquluzadə. ◻ **Gün keçirmək, gün sürmək** – yaşamaq, dolanmaq. *Əmək çəkdim, gün keçirdim, gül əkdim.* Ə.Cavad. *Burda gün keçirir bir böyük şair; Yazar yazdığını həyata dair.* S.Vurğun. *Məhəbbətsiz, gözəlsiz gün keçirmək heç nədir, Vahid; Yenə sevmək, sevilmək yaxşıdır dünyaya baxdıqda.* Ə.Vahid. **Gün görməmək** – pis yaşamaq. *Yazıq ki dövranda bir gün görmədi; Bu aləm ruhuma dar, – dedi, getdi.* M.Rahim.

8. Vəziyyət, hal mənasında. *Yaxşı günün yoldaşı, yaman günüm düşdü gəl!* (Ata. sözü). [Əziz:] *A balam Qaraş, sən bilirsənmi Həsən əmi özü nə gündə idi?* C.Məmmədquluzadə. ◻ **Günə düşmək (qalmaq)** – ...vəziyyətə düşmək (adətən pis vəziyyəti bildirir). [Musa Fərhada:] *Bu nə gündür düşübsən, ay binəva!..* Ə.Haqverdiyev. [Fatmaxanım:] *Allah, gör mən nə günə düşmüşəm ki, bu kürd gədəsi də üzümə durubdu?* N.Vəzirov.

9. *dan.* Əməkgün. *Hər yoldaş işləyib gün alan zaman; Sən durub boynunu burma, a tənbəl!* Aşıq Əli. *Xırda xala qızışmışdı. Bir gün zəhmət çəkib arıtdığı toxuma Mustafa gün yazmaq istəmirdi.* Mir Cəlal.

10. **Günüm** şəklində – nəvaziş, mehribanlıq bildirmək üçün müraciət zamanı işlədilir; əzizim. *– Ay nənə, bir nağıl de! – Ömrüm, günüm, yat daha.* Ə.Cəmil.

◊ **...gün ağlamaq** – dərdinə qalmaq, qayğısını çəkmək, gələcəyi haqqında düşünmək, fikirləşmək. *.. Bu cürəti görən, duyan olmadı; Səndən mənə gün ağlayan olmadı.* M.Araz. **Gün qayıtmaq** – 1) zenit nöqtəsindən qüruba doğru enmək, Günəş (gün) batmağa başlamaq; 2) gündüz uzanmağa (və ya qısalmağa) başlamaq. *Novruzdan sonra gün qayıdır.* **Günü başa vurmaq** – adətən əhəmiyyətsiz bir işlə məşğul olaraq günü tamamlamaq. *Bu günümüzü də belə başa vurduq.* **Günü qara gəlmək** – yaşayışı pisləşmək, fənalaşmaq. *Gündən-günə günü qara gələn sadə insana zülm üstündən zülm edilmişdir.* S.Rəhimov. **Günü qara olmaq** – yaşayışı, dolanacağı, həyatı pis olmaq. [Salatın:] *Məndən sonra anamın günü qara olacaq, qardaşım bu dərdə dözə bilməyəcək.* İ.Şıxlı. **Gününü göy əsgiyə düymək (bükmək)** – b a x **gününü qara eləmək**. **Gününü qara eləmək (etmək)** – həyatını zəhərləmək, iztirab və mənəvi işgəncə vermək. *Baxa-baxa xalü xəttə, üzarə; Zakirin gününü eylədin qarə.* Q.Zakir.

**GÜNAH** *is.* [*fars.*] 1. Dini-əxlaqi normaların pozulması, dincə qəbahət sayılan iş (*savab* əksi). *Səni mələk görəli yazmaz oldu eşqi günah; Vəli yazıldı, bu üzdən bəsi savab sana.* Füzuli. *Əfv olur möminin cümlə günahı; Sənin də könlündən keçər, ağlarsan.* M.V.Vidadi. ☐ **Günaha batmaq** – dincə qəbahət sayılan bir iş görmək. *İncitmə Zakiri bundan ziyada; Bir usan, günaha batdığın yetər.* Q.Zakir.

2. Cəzalanmalı hərəkət; təqsir. *Uşağın günahı yoxdur. – Yazıq Hacı Mirzə Həsən ağa, sənin günahın nə idi, sən nə deyirdin ki?* C.Məmmədquluzadə. *O yazığın günahı nə, təqsiri nə? Hücum çəkib Vətəninə?* B.Vahabzadə. ☐ **Günah eləmək (işləmək)** – cəzaya layiq bir iş görmək. *Səməd nə günah eləsə idi, nədə müqəssir olsa idi, nəticəsi Süräyyaya toxunacaq idi.* Çəmənzəminli. *Son zaman Rüstəm kişi oğlunun tora düşməsindən, pis bir günah işləməsindən qorxurdu.* M.İbrahimov. **Günaha batmaq** – b a x **günah eləmək (işləmək)**. *Ən böyük cinayətdir; Azadlığa qəsd etmək; Bu günaha batma gəl!* B.Vahabzadə. **Günahından keçmək, günahını bağışlamaq** – təqsirindən keçmək, bağışlamaq. [Bəhram:] *Mən xəyanət elədim, Sara, keç günahımdan!* C.Cabbarlı. *Bahadır da anasının günahını bağışlamağı* [atasından] *xahiş eləmək istədi.* M.Hüseyn. **Günahını yumaq** – təqsirindən keçilmək üçün cəzalanmalı olan hərəkətinin əvəzində yaxşı işlər görmək.

3. *məc.* Nöqsan, çatışmazlıq. *..Professor binanın günahını indi aydın elədi...* B.Bayramov.

**GÜNAHKAR** *is.* və *sif.* [*fars.*] 1. Müqəssir, təqsirkar. *Günahkarı cəzalandırmaq. – Yar yanında günahkaram; Doğru sözüm yalan oldu.* Aşıq Ələsgər. *..Günahkar muzdur özünün bəd əməlindən peşman olub, istiğfar edə-edə yerindən qalxdı.* S.M.Qənizadə.

2. Dini əxlaq normalarını pozan adam.

3. Səbəbkar; bais. [Bəhlul:] *..Mənə aydın idi ki, anamla ayrılmağın əsil günahkarı atam olub.* B.Bayramov.

**GÜNAHKARCASINA** *zərf* Günahı, təqsiri olan kimi; təqsirkarcasına. *Günahkarcasına baxmaq.*

**GÜNAHKARLIQ** *is.* Müqəssirlik, təqsirkarlıq. *Günahkarlığını boynuna almaq.*

**GÜNAHLANDIRILMA** "Günahlandırılmaq"dan *f.is.*

**GÜNAHLANDIRILMAQ** *məc.* Müqəssir tutulmaq, təqsirləndirilmək.

**GÜNAHLANDIRMA** "Günahlandırmaq"-dan *f.is.*

**GÜNAHLANDIRMAQ** *f.* Günahkar hesab etmək, müqəssir saymaq; təqsirləndirmək. *Oğruluqda günahlandırmaq. Əsassız yerə günahlandırmaq.*

**GÜNAHLI** b a x **günahkar** 1 və 2-ci mənalarda. *Şəfiqə xanım, sən də məni bağışla, mən günahlıyam.* İ.Musabəyov.

**GÜNAHSIZ** *sif.* 1. Günahı, təqsiri olmayan; təqsirsiz. *Günahsız adam. – İnsaf et, öldürmə, günahsız qulu; Əl-əldən üzülür, yaman çağıdır.* M.P.Vaqif. *Qəlbində bir yetimtək qoymadın öz kamını; Günahsız qurbanların aldın intiqamını.* S.Rüstəm.

2. Məsum. [Cəmil bəy:] *..O günahsız quşcuğazı; Məhv etməkdə nə məna var?* H.Cavid.

*Ana basdı bağrına günahsız körpəsini; Hönkür-hönkür ağladı.* B.Vahabzadə.

**GÜNAHSIZLIQ** *is.* Heç bir günahı, təqsiri olmama; təqsirsizlik.

**GÜNARASI** b a x **günaşırı**. *Salman kişi günarası .. dincələrdi.* Mir Cəlal.

**GÜNAŞIRI** *zərf* Bir gün ötürüb, o birisi gün, bir gün ötürərək; günarası. *Günaşırı tarlanı sulamaq. Günaşırı qar yağır. – Camaatı təzə ətə öyrətmiş İmaməli günaşırı* [danalardan] *birini tutub kəsirdi.* M.Hüseyn.

**GÜNBATAN** 1. *is.* Dünyanın günbatan tərəfi; qərb. *Şərəf xalanın bağı bizim evimizin günbatan tərəfində idi.* S.Hüseyn. *Hər axşam günbatandakı meşədən mahnı oxuyan bir səs yüksəlirdi.* Ə.Məmmədxanlı.

2. **Günbatanda** şəklində *zərf* – günün batdığı vaxt; axşamçağı, axşam. *Günbatanda evə gəlmək.*

**GÜNBƏD, GÜNBƏZ** *is.* [*fars.*] Yarımkürə şəklində bina damı; qübbə. *Hamamın günbəzi. – Şeşpər günbəzə elə dəydi ki, günbəzdən od töküldü.* "Koroğlu". *Bu vaxt kişilərin içindən bir şəxs ayrılıb əlində böyük bir daş, günbəzə tərəf gəldi və daşı günbəzə vurub dağıtdı..* N.Nərimanov.

**GÜNBƏDLİ, GÜNBƏZLİ** *sif.* Günbəzi olan, damı günbəd (günbəz) şəklində olan; qübbəli. *Günbəzli hamam. –* [Nəzakət:] *Gör günbəzli yerdən tüstü çıxır, Ağa Kərim hamamı yanır, ya yox?* Mir Cəlal.

**GÜNBƏGÜN** *zərf* Gündən-günə, gün keçdikcə; tədricən, günü-gündən, get-gedə. *Günbəgün arıqlamaq. Vəziyyət günbəgün yaxşılaşır. – Günbəgün əskilib şövkəti, şanı; İxtiyarı gedən bəs ağlamazmı?* M.V.Vidadi. *Səni sevən, cavan olur günbəgün; Qarımaz, qocalmaz, tər-taza gedər.* M.P.Vaqif.

**GÜNÇIXAN** *is.* Dünyanın günçıxan tərəfi; şərq. *Atıb alovunu, eyləmişdi al; Günçıxan tərəfdə olan əyri yal.* H.K.Sanılı. *Onun yeni mənzili günçıxana baxırdı.* S.Rüstəm.

**GÜNDƏLİK** 1. *sif.* Hərgünkü, hər gün olan, hər gün baş verən, adi. *Gündəlik rejim. –* [Qətibə:] *Həyatda yanılmamaq üçün onun sənə qarşı aldığı gündəlik vəziyyət və etdiyi söhbətlər barəsində mənə xəbər verməlisən...* M.S.Ordubadi. // Hər gün çıxan. *Hacı Səməd .. bu vaxt külfətə ya kitab, ya gündəlik qəzetlərdən oxuyardı.* S.S.Axundov.

2. *sif.* Birgünlük, bir gün üçün lazım olan. *Gündəlik plan. Gündəlik məlumat. – Fatma cəhrəçilik edib bir növ gündəlik çörəyini qazanırdı.* S.S.Axundov.

3. *is.* Ekspedisiya, tədqiqat, təcrübə, səyahət və s. zamanı aparılan müşahidələrin hər gün qeyd edildiyi dəftər. *Gəmi gündəliyi. Yol gündəliyi.*

4. *is.* Evə verilmiş tapşırıqları və aldığı qiymətləri yazmaq üçün şagird dəftəri. *Dərs cədvəlini gündəliyə yazmaq. Atası oğlunun gündəliyinə baxdı.*

**GÜNDƏM** *is.* 1. Həll edilməli, müzakirə edilməli məsələlər.

2. Müəyyən bir yığıncağın müzakirə edəcəyi məsələlərin siyahısı.

**GÜNDOĞAN** b a x **günçıxan**. *Ərəbistanın gündoğan tərəfində olan Mərcan dəryasına kənardan şirin su tökülmürsə, belə dəryanın suyu günbəgün şorlaşıb ağır olur.* H.Zərdabi. *Qəhrəmanlar kəndinin gündoğanı Qaratəpə, günbatanı isə Mil düzüdür.* Ə.Vəliyev. *..Gündoğandan günbatana mənzilim...* M.Araz.

**GÜNDÜZ** *is.* Gecə-gündüzün işıqlı hissəsi; gündoğandan günbatana qədər olan müddət (*gecə* müqabili). *Gündüz getmədiyin yolu gecə getmə.* (Ata. sözü). *Bir gün kişi diqqət eləyib görür ki, övrəti gündüzlər ayağına corab geymir..* C.Məmmədquluzadə. *Yaşar .. gündüz bələdlədiyi yerə yönəldi.* M.Rzaquluzadə. ☐ **Gündüz(ün) günortaçağı** – b a x **günorta** 1-ci mənada. *Onlar gündüz günortaçağı küçə bazarçalarında atışar və istədikləri adamları öldürə də bilərdilər.* M.S.Ordubadi. [Səlim bəy:] *Gündüz günortaçağı buna mat qalmışam mən; Otuz at qaçırdıblar bəyliyin tövləsindən.* S.Rüstəm.

**GÜNDÜZKÜ** *sif.* Gündüz olan; gecə deyil, gündüz baş verən. *Gündüzkü əhvalat. – Elə güc gəldi ki, ona ağrılar; Gündüzkü dərdini tamam unutdu.* B.Vahabzadə.

**GÜNEY** *is.* 1. Cənub. *Güney tərəfə getmək. –* [Hüseyn:] *..Gərək o adamın dədəsinə od vurasan və elə vurasan ki, heç bilməsin ki, bəla güneydən gəldi, ya quzeydən.* N.Vəzirov. // Sif. mənasında. *Güney tərəf.*

2. Gün düşən yer, gün tutan yer; günəşli yer (*quzey* əksi). *Təpənin güneyi. – Bura güney, hər tərəfdən gün şüalarını toplayan .. bir yer idi.* Ə.Əbülhəsən.

3. Dağın, təpənin günəş çox düşdüyündən yaxşı məhsul verən cənub yamacı. *Güneydə xır əkmək. – Dolur şirin səslərlə; kölgəli bağ, boz güney.* Ə.Cavad. *Əriyir güneylər döşündəki qar; Yağış da isladır o göy çəməni.* S.Vurğun.

**GÜNEYLİK** *is.* Güney yer, gün düşən yer. *Şərbaflar burdan kənara daha güneylik yerə çəkilirdilər.* Ə.Əbülhəsən.

**GÜNƏBAXAN** *is.* Tumundan yağ alınan uzungövdəli, iri sarı, güllü birillik bitki. *Günəbaxan toxumu. – Həyətdə iki-üç günəbaxan gözə çarpırdı.* M.S.Ordubadi. □ **Günəbaxan yağı** – günəbaxan tumundan alınan yağ.

**GÜNƏBAXANLIQ** *is.* Günəbaxan əkilmiş yer, günəbaxan tarlası. *Günəbaxanlığı alaq etmək.*

**GÜNƏBİR** *zərf* Hər gün, gündə.

**GÜNƏMUZD** *sif.* 1. Əmək haqqı gün hesabı ilə ödənilən. *Günəmuzd əmək haqqı sistemi. Günəmuzd fəhlə.*

2. Əmək haqqı işlədiyi günlər hesabı ilə ödənilən müvəqqəti işdə işləyən. *Bir-iki ay təsadüfi günəmuzd işlər görür.* S.Hüseyn. // Zərf mənasında. *Əjdər neçə vaxt idi ki, stansiyada günəmuzd işləyirdi.* S.Rəhman.

**GÜNƏMUZDÇU** *sif.* Günəmuzd işləyən. *Günəmuzdçu fəhlə.*

**GÜNƏMUZDÇULUQ** *is.* Günəmuzd işləmə.

**GÜNƏŞ** *is.* 1. Planet sisteminin işıq və istilik verən, közərmiş böyük şar şəklində olan mərkəzi göy cismi; gün. *Günəş işığı. Günəş də batanda rəngi saralır. – Toz-torpaq göyün üzünü elə bürümüşdü ki, günəş görünmürdü.* A.Şaiq. □ **Günəş saatı** – günəş işığı vasitəsilə vaxtı təyin etmək üçün siferblatlı cihaz. **Günəş sistemi** – Günəş və onun ətrafındakı planetlərdən ibarət göy cisimlərinin hamısı birlikdə. *Şairi küsdürən dünyanı üzüb; Günəş sistemindən atmaq da azdır!* M.Araz.

2. Günəşin verdiyi işıq, istilik. *Muğan günəşi adamı yandırırdı.* M.İbrahimov. □ **Günəş vannası** müalicə məqsədilə bədəni açıq havada, günəş şüaları altında saxlama.

3. *məc.* Klassik şeirdə və folklorda gözəlin sifəti günəşə bənzədilir (adətən tərkiblərdə işlədilir). *Günəş camallısan, gül yanaq ilən; Mən incəlib yengi aya dönmüşəm.* M.P.Vaqif. *O gül cəmalını, bilməm, nə üzlə vəsf eləyim; Günəş deyim, gözəlim, ya deyim sitarə sənə?!* Ə.Vahid.

◊ **Günəşi batmaq** – süqut etmək, əvvəlki şan-şöhrətini itirmək; inkişafdan qalmaq. **Günəş gülmək (gülümsəmək)** *şair.* – sevinmək, ruhlanmaq. *Seyranə çıxıb dağda, çəməndə; Güldükcə günəş mən də gülərdim.* H.Cavid. *Təbiət dirçəldi, həyəcana gəldi; Günəş gülümsündü dağlar başından.* B.Vahabzadə. **Günəşi salamlamaq** *şair.* – günəş doğan zaman oyaq olmaq, günəşin çıxmasını görmək. *Keşikçilər günəşi salamlayır, şəhər üzərində açılan yeni, gözəl bir səhərin müjdəçisi olurlar.* H.Seyidbəyli. **Günəşin altı** – dünya, aləm. [Qoca:] *Lakin günəşin altında heç bir şey baqi deyil.* Çəmənzəminli.

**GÜNƏŞLİ** *sif.* 1. Günəşin işığı ilə nurlanmış, işıqlı, günəş olan. *Günəşli gün. – Aləm bilir bu yolun hər zaman ilham dolu; Günəşli gündüzləri, aylı gecələri var.* S.Rüstəm. *Cavahir onu arabir günəşli havalarda gəzməyə də çıxarırdı.* H.Seyidbəyli.

2. Günəş düşən, işıqlı. *Günəşli otaq. – Gəmi günəşli sahilə yaxınlaşır.* M.Rzaquluzadə.

3. *məc.* Xoşbəxt, sevincli, fərəhli, işıqlı. *Günəşli tale. – İrəlidə günəşli, xoşbəxt bir gələcək var.*

**GÜNƏŞLİLİK** *is.* Günəşli yerin, ya havanın halı; günəşlə işıqlanma. *Havanın günəşliliyi.*

**GÜNƏŞSİZ** *sif.* 1. Günəş olmayan, işıq olmayan, günsüz. *Günəşsiz hava.*

2. Gün düşməyən, işıqsız. *Günəşsiz zirzəmi. Günəşsiz otaq. – Zindanın işıqsız, günəşsiz qaldı; Hümmətin ucadır, dam alçaq, Nəbi!* Şəhriyar.

**GÜNƏŞSİZLİK** *is.* Günəşsiz yerin və ya havanın halı. *Havanın günəşsizliyi.*

**GÜNƏŞUM** *is.* Şumlanıb günəş altında qalmış əkilməyən yer.

**GÜNƏVƏR** bax **güney** 2-ci mənada. *Anası* [Tapdığın] *qolundan tutub, həyətə, günəvər bir yerə çıxartdı.* Ə.Vəliyev.

**GÜNGÖRMƏZ** *sif.* 1. Heç zaman gün düşməyən, günəş işığı görməyən. *Güngörməz zirzəmi.*

2. *məc.* Heç kəsin görmədiyi; gizli, məxfi. [Nemətullayev] *Mənzər vasitəsilə bacaqlı, kəmər, saat və sair bu kimi qiymətli şeylər alaraq yaxın şəhərdəki baldızının güngörməz sandığında saxlardı.* S.Rəhimov.

**GÜN-GÜNORTA** *is.* Günorta, günəşin günortaya yaxınlaşdığı vaxt (vaxtın, günün keçmək üzrə olduğunu bildirir). *Dağın zirvəsində gün-günortadır; Dərənin dibini haqlayır axşam.* M.Araz.

**GÜN-GÜZƏRAN** *is.* Güzəran, dolanacaq, yaşayış.

**GÜNHESABI** *zərf* Zəhmət haqqı gün hesabı ilə ödənilən; günəmuzd. *Günhesabı işləmək.*

**GÜNLƏMƏ** "Günləmək"dən *f.is.*

**GÜNLƏMƏK** *f.* Bütün günü güdmək, göz qoymaq. *..Pası Gülsənəmi günləyir, ona Hatəmxanın evinin həndəvərindən belə bulağa getməyə yol vermir.* S.Rəhimov.

**GÜNLÜ** bax **günəşli**. *Günlü hava.*

**GÜNLÜK** *is.* 1. Rəqəmlərdən sonra gələrək işin neçə gündə görüləcəyini və ya görülə biləcəyini, yaxud şeyin neçə günə çata biləcəyini və s. bildirir. *İki günlük işim qalıb. Üç günlük odun.* – [Əvvəlinci kəndli:] *Həkim bir günlük yolda olur...* Ə.Haqverdiyev.

2. *Sif. mənasında.* Hərgünkü. *Onsuz da qəzetlərimizin günlük nömrələrində "Ay camaat, ayılınız!" – deyib də çağırmışıq.* N.Nərimanov.

3. Bəzi baş geyimlərinin qabaq tərəfinə – alnın üzərinə düşən hissəsinə tikilən yarımdairəvi dəri, karton və s. parçası. *Günlüyü əyilmiş boz şapkasının altından ağ saçları görünən usta .. əlini Tahirə uzatdı.* M.Hüseyn. [Oğlanın] *.. boynunda ala-bəzək qalstuk, başında günlüyü uzun kepka var idi.* İ.Əfəndiyev.

4. Günəşdən, yağışdan qorunmaq üçün əllə baş üstündə tutulan çətir; zont. *Nayiblər əllərində günlük .. yolun kənarında düzülüb səhərdən axşama kimi müntəzirdilər.* C.Məmmədquluzadə. [Oğlan:] *Ana, nə qədər yoruldum, oturmayaqmı? – deyə, əlindəki günlüyə söykəndi.* A.Şaiq.

5. Günəş düşən yer, günəş şüalarının işıqlandırdığı yer. *Günlükdə çadır qurmaq. Günlükdə məhsul yaxşı bitir.*

6. Bax **gün** 7-ci mənada. *Günlüyü pis keçmir.*

**GÜNLÜKLÜ** *sif.* Günlüyü (3-cü mənada) olan. [Şahmar] *Qarakişinin uzun günlüklü boz şapkasını gördü, tez geri qayıtdı.* B.Bayramov.

**GÜNORTA** *is.* 1. Gündüz saat 12, günəşin üfüq üzərində ən yüksək nöqtəyə çatdığı vaxt. *Günortadan sonra şəhərin bütün əhalisi cıdır düzünə tərəf axışmağa başladı.* Çəmənzəminli.

2. Həmin vaxta aid, günorta vaxtı gedən, gələn, olan. *Günorta qatarı.* – [Mozalanbəy:] *Sabah saat xoşdur, inşallah, günorta maşını ilə yola düşərsiniz.* Ə.Haqverdiyev. [Tələbə:] *Mən günorta azanını gözləyirdim.* S.Hüseyn. ☐ **Günorta yeməyi (çörəyi)** – günorta vaxtı yeyilən yemək. [Musanın nəvəsi] *bir gün günorta çörəyinə öz ayağı ilə bizə təşrif buyurdu.* Qantəmir. *Bir dəfə günorta çörəyindən sonra mən yerimin içində uzanaraq kitab oxuyurdum.* M.İbrahimov.

**GÜNORTALIQ** *is.* Başın orta hissəsi; təpə. *Yenə papağını günortalığa qaldıran faytonçu .. atları açıb yemləməyə başladı.* M.Hüseyn.

**GÜNORTAÜSTÜ** *zərf* Saat on iki radələrində; günorta. [Məşədi İman:] *Sabah günortaüstü yoldaşlar gedirlər.* Ə.Haqverdiyev. *Günortaüstü poçtalyon Bahadura təcili bir məktub gətirdi.* S.Rəhman.

**GÜNSÜZ** bax **günəşsiz**. *Günsüz hava. Günsüz yer.*

**GÜNÜ** *is.* 1. Köhnə məişətdə: birinci arvadın üstünə alınan ikinci və ya üçüncü arvad. *Hacı evə günü gətirmək niyyətini Münəvvər xanımın qulağına elə doldurdu ki, arvadın heç ruhu da incimədi.* Mir Cəlal. // Bu cür ailədəki arvadlardan hər biri. *Günülərin davası.* – [Nazlı:] *Təzə arvad günüsündən hər gün ərinə bir söz deyir, əri də yazıq arvada sitəm eləyirmiş.* Çəmənzəminli. *Cırmaqlama, didişmə olur, günülərin*

*birisi digərinin xınalı saçlarını çəngə-çəngə yolurdu.* S.Rəhimov.

2. *məc.* Düşmən, rəqib mənasında. *Ancaq o çox sadədir; tərifi-zadı sevməz; Elə bil ki, şöhrətlə; qanlıbıçaq, günüdür.* R.Rza.

◊ **Günü düşmək** – birilə düşünüşmək, düz gəlməmək, ziddinə getmək. *..Göyərçin çox-çox ildi ki, Gülsənəm qızla günü düşübdür.* S.Rəhimov.

**GÜNÜQARA** b a x **qaragün**. *Gün sənin əlindən günüqaradır.* Q.Zakir. [Qəndab:] *Ancaq mən günüqara, uşaq olub evin küncündə qalacağam.* B.Bayramov.

**GÜNÜQARALIQ** *is.* Günüqara adamın vəziyyəti; bədbəxtlik, qaragünlük.

**GÜNÜLƏMƏ** "Günüləmək"dən *f.is.*

**GÜNÜLƏMƏK** *f.* Düşmən olmaq, xoşlamamaq, günü kimi baxmaq, yola getməmək. *Ayna Əbülfəzi günülədiyi kimi, Əbülfəz də onu xoşlamırdı.* Ə.Vəliyev.

**GÜNÜLÜK** *is.* 1. Köhnə məişətdə: bir kişinin iki və ya bir neçə arvadı arasındakı münasibət. [Fərəc] *iki arvad almışdı ki, onlardan biri günülüyə davam etməyib, ikinci arvadı alandan sonra o dünyaya köçmüşdü.* Ə.Haqverdiyev.

2. Özünü günü kimi aparma; yola getməmə. [Gülbadam] *zəif, naxoş arvada nəinki günülük etməzdi, hətta bir az da hörmət edərdi.* N.Nərimanov.

3. B a x **günü** 1-ci mənada. *Günülüyü ilə yola getməmək.*

**GÜNVURMA** *is.* Günəş şüalarının təsirindən beyin mərkəzinin zədələnməsi. *Günvurmadan ölmək. Özünü günvurmadan qorumaq.*

**GÜNYAŞAR** *sif.* 1. *zool.* Ancaq bir gün ömrü olan, bir gün yaşayan (cücü haqqında).

2. *məc.* Efemer.

**GÜNYƏ** *is.* Düzbucaqlı və ya şaquli xətlər çəkmək üçün üçbucaq formalı xətkeş.

**GÜRCÜ** *is.* Gürcüstanın əsas yerli əhalisini təşkil edən, iber-Qafqaz dillərindən birində danışan xalq və bu xalqa mənsub adam.

**GÜRCÜCƏ** *sif.* və *zərf* Gürcü dilində. *Gürcücə danışmaq.*

**GÜRDƏK** *is. məh.* 1. Taxtadan, kağızdan və ya başqa bir şeydən qayrılmış qapaq, tıxac.

2. Yaranın içinə qoyulan pambıq, ya bint parçası; piltə, tampon.

**GÜRRAH** *is.* Dəstə ilə çox adamın səs-küylə birlikdə və birdən-birə bir işə başlaması. // Qələbəlik, axın, bir şeyin qızğın çağı. *Sabah ertə alan çoxlu olur, ancaq axşamüstü bazara ləngiyənlər, alıcının gürrahına düşməyənlər ucuz satırlar.* S.Rəhimov.

□ **Gürrah vurmaq (çəkmək)** – səs-küylə, qışqırıqla, birdən-birə bir işə başlamaq, yaxud yüyürüşmək, axışmaq, hücum etmək. *Uşaqlar gürrah çəkdilər.*

**GÜRŞAD** *is.* İri giləli bərk yağış. *Belə gürşad yağmurlar üçün babalar deyiblər ki, yağış yağar, varlının süsünü aparar, yoxsulun hisini.* M.Rzaquluzadə.

**GÜRUH** *is.* [*fars.*] Qeyri-mütəşəkkil, şüursuz, cahil adamlar yığını, yaxud pis bir niyyətlə birləşmiş adamlar dəstəsi. *Bəzən yaxşını pisdən, qaranı ağdan seçə bilməyən güruhun nə qədər dəhşətli olduğunu Tərlan çox gözəl bilirdi.* M.Hüseyn. // *klas.* Ümumiyyətlə, dəstə.

**GÜRZ** *is.* 1. Müxtəlif işlərdə işlədilən çox ağır, iri çəkic. *Qollarını çırmayıb, gürz endirir zindana.* Ə.Cəmil.

2. Qədimdə: başı dəmir və ya daşdan olan toppuz; silah kimi işlədilən, baş tərəfi enli, ağır dəyənək. *Dəmirçioğlu getdi, qılınc, qalxan, cida, gürz götürdü, Koroğlunun yanına qayıtdı.* "Koroğlu".

**GÜRZƏ¹** *is.* Daşlıq, qayalıq, kolluq yerlərdə yaşayan boz rəngli, arxasında əyri parlaq zolaqlar olan zəhərli ilan.

**GÜRZƏ²** *is.* Nazik yayılıb doğranmış xəmir parçalarının içinə döyülmüş ət qoyulub bükülərək bişirilən xörək; girs.

**GÜŞBƏRƏ** b a x **düşbərə**. *..Gəldi evə, arvad güşbərə bişirmişdi, bir neçə boşqab yeyib istədi yatsın, yuxusu gəlmədi.* Ə.Haqverdiyev.

**GÜVƏ** *is. zool.* Yun şeylərə, taxıla və s. bitkilərə zərər vuran bir böcək cinsi. *Güvə dəymək* (*düşmək*). – *Kiçik və ipək xalçalar bükülüb güvə dəyməmək üçün tütünə qoyulmuşdu.* M.S.Ordubadi.

**GÜVƏC** *is.* Gildən qayrılan (bəzən içində xörək bişirilən) boğazı dar qab. *Güvəcdə qatıq qoymaq. – Adımı güvəc qoy, amma*

*ocaq üstə qoyma.* (Ata. sözü). *Arvad sevincindən özünü itirdi və əlindəki güvəci salıb sındırdı.* Q.İlkin.

◊ **Güvəc yumbalanıb qapağını tapar** – hər kəs axırda öz tayı ilə rastlaşar, öz tayını tapar.

**GÜVƏQIRAN** *is. dan.* Naftalin.

**GÜVƏNC** *is.* Arxalanmalı, etibar olunmalı, güvəniləsi adam və ya şey.

**GÜVƏNMƏ** "Güvənmək"dən *f.is.*

**GÜVƏNMƏK** *f.* 1. Arxalanmaq, bel bağlamaq. *Atasına güvənmək. – Sənə güvəndiyim dağlar, sənə də qar yağarmış.* (Ata. sözü). *Ellərə güvənib yazsa sənətkar; İlham xəzinəsi tükənməz olar.* S.Vurğun.

2. Lovğalanmaq, öyünmək, qürrələnmək, boş yerə fəxr etmək. [Bayram:] *..Sonra qızlar içində güvənəcəksən ki, guya sənin də ərin var?* M.F.Axundzadə. *İncə xanım çox güvənir özündəki gözəlliyə.* S.Vurğun.

**GÜYƏMƏ** *is. bot.* Qısa saplaqları, uzunsov yarpaqları olan kol sarmaşığı.

**GÜYÜM** *is.* Su daşımaq və ya saxlamaq üçün boğazı uzun, iri qulplu, mis qab; mis səhəng. *O biri uşaqlar məktəbə həftədə iki güyüm su versəydilər, Ağabala beş-altı güyüm verərdi.* Çəmənzəminli. [Ruqiyyə] *əl və üzünü yumuş, qızılgül kimi təzə və tər, su güyümü çiynində gəldi.* A.Divanbəyoğlu.

**GÜZ** *is. köhn.* 1. Payız. *Güz almasıtək al yanaqlum...* "Dədə Qorqud".

2. *məh.* İki əkin sahəsi arasında sərhəd; şumlanıb qalan yer.

**GÜZAR, GÜZƏR** *is.* [*fars.*] *klas.* Yol, keçid, keçmə. *Gecə-gündüz duam budur Tanrıma; Nola səni sala bir güzarıma.* M.P.Vaqif. ☐ **Güzar etmək** *klas.* – keçmək, getmək. *Ol güli-xəndanı görmək mümkün olsaydı mənə; Səntək, ey bülbül, gülüstanə güzar etməzmidim?* Füzuli. *O gündən ki göz önündən gedibsən; Etməmişəm gülüstanə güzar mən.* Q.Zakir. *Qış günü bərk çovğun idi bir səhər; Cütçü baba yoldan edirdi güzər.* A.Səhhət. **Güzarı düşmək** – yolu düşmək. *Müşk adında bir pəhləvan yolla gedəndə güzarı düşür qalaçaya.* (Nağıl). *Sevdiciyim, hanı gözəllər xanı? Güzarımız sizin otağa düşdü.* A.Ələsgər.

**GÜZARİŞ** *is.* [*fars.*] *klas.* 1. Hadisə, vaqiə, əhvalat. [Divanbəyi:] *Zahirən görünür ki, Bayram müqəssir deyil, əgərçi güzariş onun təqsirinə çox dəlalət edirdi.* M.F.Axundzadə.

2. Göstəriş, əmr. *Güzariş vermək.*

**GÜZDƏK** *is.* Payızda göyərən ot, payız otu. *Qoyunlar payızın güzdək otundan ağızdolusu götürüb xoşallanırdılar.* S.Rəhimov. *Nəmişlik olduğundan güzdək dizə çıxırdı.* Ə.Vəliyev. // Payız otlağı. *Qaraca çoban dəstəsilə gəlib güzdəyə çatanda, ona söylədilər ki, anası, bacıları gəlib qardaşlarının meyitlərini obaya aparmışlar.* M.Rzaquluzadə.

**GÜZDƏKLƏŞMƏ** "Güzdəkləşmək"dən *f.is.*

**GÜZDƏKLƏŞMƏK** *f.* Payızda ot göyərmək.

**GÜZƏM** *is.* Yayın ikinci yarısında qırxılan qoyun yunu. // Quzu yunu. *Nəcəfalının əynində güzəmdən toxunmuş şalvardan, çit köynəkdən başqa heç nə yox idi.* B.Bayramov.

**GÜZƏRAN** *is.* [*fars.*] Dolanacaq, dirilik, yaşayış, həyat. *Məktəbdə Səlimin güzəranı çox da gözəl keçməyirdi.* İ.Musabəyov. [Nəbi:] *Nədir bu güzəran, nədir bu həyat? Xalqa divan tutur bir yığın cəllad!* S.Rüstəm. ☐ **Güzəran etmək** – dolanmaq, yaşamaq, keçinmək. *Kəndin camaatı hamısı maldarlıqla güzəran edir.* Ə.Haqverdiyev. *Bu kəndin əhli əkinçilik və çarvadarlıqla güzəran edərdi.* S.S.Axundov.

**GÜZƏRANLI** *sif.* 1. Bu və ya başqa cür güzəran keçirən, dolanacağı, həyatı olan. *Pis güzəranlı. Yaxşı güzəranlı. Xoş güzəranlı.*

2. Həyatı yaxşı keçən, firavan yaşayan. *Bulağın hər iki tərəfinin lap güzəranlısı* (is.) *belə ancaq qonaq olan zaman ağ dəmir çıraq yandırardı.* S.Rəhimov. // Güzəranı, həyatı yaxşı olan, varlı; yaşayışında çətinlik çəkməyən. *Güzəranlı adam.*

**GÜZƏRANLIQ** *is.* 1. Yaşayış, keçinəcək, dolanacaq. [Hacı Nuru şair:] *..Hər kəsin öz sənəti özünə iksirdir və xoş güzəranlığına baisdir.* M.F.Axundzadə.

2. Yaşayış üçün lazım olan maddi nemətlər. *Çəkirsə onlar gecə-gündüz nigaranlıq bizə nə! Tapmayır ac-yalavaclar güzəranlıq,*

*bizə nə!* M.Ə.Sabir. *O gün olaydı nə mənzil dərdi qalaydı; nə güzəranlıq dərdi.* R.Rza.

**GÜZƏRANSIZ** *sif.* Güzəranı yaxşı olmayan, dolanacağı pis olan, həyatı ağır keçən.

**GÜZƏRGAH, GÜZƏRGƏH** *is.* [*fars.*] *klas.* Keçilən yer, keçid, yol. *Gəzmə, ey könlüm quşu, qafil fəzayi-eşqdə; Kim, bu səhranın güzərgəhlərdə çox səyyadı var.* Füzuli. *Amansız, qansız ovçuydu, güzərgahlarda tor qurdu; Dağılmış aşiyan qoydu, əlində ox-kaman keçdi.* Şəhriyar. // Gəzinti yeri, gəzmək üçün yer. *Professor Kəngərli gün batıb sadaq qalxana qədər sahil güzərgahında tənha gəzdi.* B.Bayramov.

**GÜZƏŞT** *is.* [*fars.*] Başqasının xeyrinə olaraq bir şeydən və ya öz fikrindən əl çəkməyə razılaşma, əl çəkmə. // Alış-verişdə qiyməti aşağı salma. // Bağışlama, keçmə (borc, günah haqqında).

◊ **Güzəşt etmək (eləmək)** – 1) bax **güzəştə getmək** 1-ci mənada. [Nərgiz:] *Mən səadəti öz doğma bacıma güzəşt eləyə bilmədim..* B.Bayramov; 2) alış-verişdə qiyməti aşağı salmaq. [Konduktor] *uzaqdan gələn yolçulara, görünür, güzəşt edirdi.* Qantəmir; 3) *köhn.* keçmək, ötmək. *Altmışı sinnim eləyibdir güzəşt.* Ə.Nəzmi; 4) bağışlamaq, təqsirindən keçmək. *Uşağa güzəşt etmək.* – [Nazir:] *Fəqət mən bu dəfəlik sizə güzəşt edirəm.* S.Hüseyn. **Güzəştə getmək** – 1) başqasının xeyrinə bir şeydən əl çəkmək. *Rəşid atasının kövrəldiyini və danışarkən səsinin titrədiyini hiss edib, istər-istəməz güzəştə getdi..* M.Hüseyn; 2) bax **güzəşt etmək** 2 və 3-cü mənalarda. *Qiymətdə güzəştə getmək.*

**GÜZƏŞTLİ** *sif.* Güzəşt ilə olan, güzəşt ilə satılan, nisbətən ucuz. *Güzəştli mövsümi bilet. – Yanvarın 1-dən etibarən şəhərlərarası telefon danışıqları üçün yeni güzəştli qiymətlər müəyyən edilir.*

**GÜZGÜ** *is.* 1. Qarşısındakı şeylərin şəkillərini əks etdirən, xüsusi surətdə pardaqlanmış şüşə lövhə; ayna. *Bədənnüma güzgü. Cib güzgüsü. – Bir güzgüyə gər açıb gözünü; Güzgüdə görəydi öz-özünü.* Füzuli. [Məşədi İbad] *güzgüyə baxıb ora-burasını düzəldir.* Ü.Hacıbəyov.

2. *məc.* Hər hansı hadisəni, prosesi özündə əks etdirən şey. *Folklor xalqın həyatının güzgüsüdür. – Şairin şeri yaşadığı xalqın simasını göstərən bir güzgü olmalıdır.* M.S.Ordubadi. *Mən səni gördükcə gözlərim yanır; Sən ey gəncliyimin güzgüsü, bahar!* S.Vurğun.

◊ **Güzgü kimi** – aydın, parlaq, açıq, aşkar, ləkəsiz, şəffaf, ayna kimi. *Vaqifəm, yoxdur mənə cahi-zənəxdandan nicat; Göstərir əhvalımı aydın üzün güzgü kimi.* M.P.Vaqif.

**GÜZGÜÇÜ** *is.* Güzgü qayıran usta.

**GÜZGÜLÜ** *sif.* Güzgüsü olan, üzərinə güzgü keçirilmiş, güzgü salınmış; aynalı. *Güzgülü şifoner.* – [Züleyxa] *güzgülü şkafdan ipək pijamasını götürüb geydi..* M.İbrahimov.

# Hh

**H** Azərbaycan əlifbasının on birinci hərfi. b a x **he**.

**HA**[1] Nida kimi aşağıdakı mənalarda işlənir:

a) saqındırma, xəbərdarlıq və ya əmr, tapşırıq bildirir, habelə diqqəti cəlb etmək üçün işlədilir. *Ona bir söz demə ha! Özünü gözlə ha! Ora getmə ha!* – [Minnət xanım:] *Ancaq mən olduğumu demə ha!* Ü.Hacıbəyov. [Turac:] *Ey, düz-əməlli danış ha!* İ.Əfəndiyev. *Kəblə Abbasəli naqanı tuşladı*: – *Al gəlsin, vurdum ha!* Mir Cəlal.

b) təkid, vaciblik, lazımlıq bildirir. *Bizə gələrsən ha! Xahişimi unutma ha!* – [Ana:] *Qızlar, mənim bu balamdan muğayat olun ha!* (Nağıl).

c) heyranlıq, valehlik bildirir. *Gözəldir ha!*

ç) intonasiyadan asılı olaraq, bəzən sözə, cümləyə istehza, rişxəndlik çaları verir. *Amma yazmısan ha. Ay tutdun ha.* – [Hatəm:] *Budu ha!..* [Düşmən] *gəlib çıxıb ey..* Ə.Əbülhəsən.

d) təkrar bildirir – nə qədər. *Ha deyirəm, təsir etmir. – Hər bir qəzeti əlimizə alsaq, görəcəyik ki, elə haman sözlərdir ki, ha eşidirik.* C.Məmmədquluzadə.

**HA**[2] Ziddiyyət bildirən ədat – ki. *Nə olsun, adımız olubdur qoçaq; Ceyran ha deyilik ovçudan qaçaq.* H.K.Sanılı.

**HA**[3] *əvəz.* 1. Qeyri-müəyyən zaman və ya yer bildirir; hansı. *Məşədi Əsgər dinməzsöyləməz qapıdan çıxıb yola düşdü. Ha tərəfə getmək lazım olduğunu özü də bilmirdi.* S.M.Qənizadə. *Ha zamandansa Məsmə eşitmişdi ki, dərmanların yaxşısı ələfiyyatdır.* Mir Cəlal.

2. Bir şeyin davamlılığını bildirir; nə qədər. *Keçəl ha ağladı ki, qovunu ver, lotubaşı vermədi.* "Aşıq Qərib". ..*Ənvər ha fikirləşdi, Ayaza layiq və münasib bir cavab tapmadı.* Mir Cəlal.

**ha-ha, ha-ha-ha** *nida.* Qəhqəhə, gülüş bildirmək üçün səs təqlidi söz kimi işlənir. [Mübaşir Məmməd Musa kişiyə:] ..*Yoxsa bir gözləmən var, ay lotu! Ha-ha-ha! Yəqin gözləmən var.* M.İbrahimov.

**HABELƏ** *zərf* Bunun kimi, bu cür, belə; həmçinin. *İrəvanda iyirmi min müsəlman uşağı var, bunların bir-iki yüzü ancaq dərsə gedir. Bakı, Tiflis, Naxçıvan, Şamaxı və qeyri şəhərlər də habelə.* C.Məmmədquluzadə. *Yağı, pendiri dəyər-dəyməzinə, cürbəcür arşın malına, sabuna, güzgüyə, saqqıza... və habelə şeylərə dəyişərlər...* Ə.Haqverdiyev.

**HACƏT** *is.* [*ər.*] 1. Ehtiyac, lüzum. *Bu qədər söhbətə nə hacət. Təfərrüata hacət yoxdur. – Yox, yazmaram! Amma hələ qoy yazım; Hacət olsa, bundan belə yazmaram.* M.Ə.Sabir. *Üzün gördü şeyda könül məst oldu; Nə hacət ki, həşr olunca ayinə.* M.V.Vidadi.

2. *dan.* Alət, karastı; silah.

**HACI** *is.* [*ər.*] *din.* Məkkəni ziyarət etmiş müsəlmanlara verilən ad. *Hacısan, məşhədisən, sahibimizsən, ağasan; İstəyirsən həmi qırxıb bizi, həm də sağasan?* Ə.Nəzmi.

◊ **Hacılar yolu** – b a x **kəhkəşan**. *Hacılar yolunda böyük bir ulduz; Uzaq üfüqlərə sayə salmışdı.* S.Vurğun.

**HACIBƏRİBAX, HACIMƏNƏBAX** *is. köhn.* Qadın paltarı tikilən bahalı əlvan bir parçanın xalq dilində adı. [Minayə] *bir neçə il əvvəl hacıbəribax deyilib arvadlar arasında çox modda olan, əlvan parçadan geydiyi qırçınlı uzun tumanda .. çox yaraşıqlı görünürdü.* Ə.Əbülhəsən.

**HACIYATMAZ** *is.* Aşağı tərəfi ağır olduğu üçün həmişə dik duran uşaq oyuncağının adı: gəlincik.

**HACILEYLƏK** 1. B a x **leylək**. *Bahar çağı hacıleyləklər; Qaranquşlar gələrmiş.* R.Rza.

2. *zar.* Uzundraz, boyu həddindən artıq uzun adam haqqında. [Səkinə Rüstəmə:] *Yuxuma qara-qura gətirən sənin bu uçulmuş dayaqlarındır, bu hacıleylək Yarməmməd, bu goreşən, saman altdan su yeridən yastı Salmandır.* M.İbrahimov.

**HAÇA** *is.* və *sif.* Ağacın bucaq şəklində ayrılmış gövdəsi və ya budağı, habelə haçalanmanın başlandığı yer. *Alçaq əncir ağacının əyri haçasında oturan iki nəfər qara, yanıq oğlan uşağı bir-birinə püstə qabığı atırdı.* Mir Cəlal. *Tut ağacının balkona enmiş haça budağı arasından sayrışan ulduzlar görünürdü.* İ.Hüseynov. // Ümumiyyətlə, haça şəklində olan. *Dağın haça zirvəsi.*

– *Giziroğlu Mustafa bəyin bir şeşpəri var idi ucu haça.* "Koroğlu". *Sinə dümağ, quyruq haça; Bir quş qondu bir ağaca.* M.Dilbazi. // *məc.* Üstüörtülü, ikibaşlı. *Ataş* [Mirzənin suallarındakı] *haça mənanın fərqinə varmadan cavab verdi.* Ə.Vəliyev.

**HAÇABAŞ(LI)** *sif.* Başı haça şəklində olan. *Haçabaş dağ. Haçabaş dəyənək.* – *Əllərində haçabaşlı, uzun çomaq tutmuş uşaqlar sağım yerindən xeyli aşağıda duran qoyun sürüsünə doğru yüyürdülər, bir dəstə sağmal qoyun ayırıb yuxarı sürdülər.* M.Hüseyn.

**HAÇABUYNUZ(LU)** *sif.* Buynuzu haça şəklində olan. *Haçabuynuz qoç. Haçabuynuz buğa.*

**HAÇADIRNAQ(LI)** *sif.* Dırnağı haça olan, qoşadırnaq (inək, qoyun və s. heyvanlar haqqında). *Yanında balası o haçadırnaq; Əlvan çiçəkləri ipçin yolardı; Məmələri dadlı südlə dolardı.* H.K.Sanılı.

**HAÇADİL(Lİ)** *sif.* Dili haça şəklində olan, dilinin ucu yarıq olan (ilan, kərtənkələ, qurbağa və s. haqqında). *Qədimdən bizim eldə sınanmış bir məsəl var; "Ulduz görməsə ölməz haçadilli ilanlar".* R.Rza.

**HAÇAQ** b a x **havaxt**. *Haçaq yola düşürsən? Qatar haçaq gəlir?* – *Əlimdən bıçaq düşdü; Bilmədim haçaq düşdü; Viran qalsın qəriblik; Yar məndən qaçaq düşdü.* (Bayatı).

**HAÇAQUYRUQ** *is. bot.* Çoxillik sünbüllü ot. b a x **kornet**.

**HAÇAQUYRUQ(LU)** *sif.* Quyruğu haça şəklində olan. *Nə üçtelli durna, nə də; haçaquyruq qaranquşam; Bütün qışı cikkildəyib; Yem axtaran hansı quşam?* M.Dilbazi.

**HAÇALAMA** "Haçalamaq"dan *f.is.*

**HAÇALAMAQ** *f.* Haça kimi iki yerə ayırmaq. *..Sözünü qurtarıb yenə saqqalını haçaladı.* S.M.Qənizadə.

**HAÇALANMAQ** 1. *məch.* İki yerə ayrılmaq, bucaq şəklində iki istiqamətdə uzanmaq (yol, çay və s. haqqında). *Kəndə çatanda yol haçalandı.*

*2. t-siz.* Haça şəklində olmaq, iki tərəfə ayrılmaq, haça əmələ gətirmək. [Rza:] *Qayanın haçalandığı və ağaclarla örtüldüyü xəlvət guşəyə sığındım, Ulduz gəldi.* M.İbrahimov.

**HAÇALAŞMA** "Haçalaşmaq"dan *f.is.*

**HAÇALAŞMAQ** b a x **haçalanmaq**. *Şiddətli küləklərin nəticəsində qayalar get-gedə sivriləşir, haçalaşırdı.* S.Vəliyev. *Yol haçalaşanda Muxtar əlini sağ tərəfə tuşlayıb Şahinə göstəriş verdi..* B.Bayramov.

**HAÇALI** *sif.* Haça şəklində olan, haçası olan. *Haçalı yol.* – [Uşaq] *qarşıdakı zirvəsi haçalı qayalar başında qara qanadlarını açıb yüksəlmək istəyər .. buludu görərkən cəld nənəsinin qolundan tutdu..* Ə.Məmmədxanlı. *Mövzularım tükənəndə darıxır masam; Onun dərdi yüz haçalı, onun dərdi min!..* M.Araz.

**HAÇAN** "Haçaq"ın deyiliş forması. [Rza bəy:] *Söylə görüm, toy haçandır?* Ü.Hacıbəyov. *Nur zülmətsiz haçan oldu? Zülmətdən nur içən oldu!* M.Araz.

**HAÇANDAN-HAÇANA** *zərf* Nəhayət, axırda, çox vaxt keçəndən sonra. *Haçandan-haçana gəlib çıxdı.* – [Gülnaz] *haçandan-haçana xatırladı ki, bu gəncə parkda iki-üç dəfə rast gəlmişdir.* İlkin. *Həsrət haçandan-haçana gözlərini kağızdan ayırıb dilləndi.* B.Bayramov.

**HAÇASAQQAL(LI)** *sif.* Saqqalı haça şəklində olan. *Haçasaqqal qoca.* – *Haçasaqqal bir kişi üçüncü zəngi çalan kimi salondakı neft lampalarının işığını azaltdı, zal qaranlıqlaşdı.* S.Rəhman.

**HADİSƏ** *is.* [*ər.*] 1. İctimai və ya şəxsi həyatda vaqe olan, baş verən hal; əhvalat, vaqiə, vəqə. *Bütün bu hadisələr yanaşı oturan adamların təsəvvürlərində canlanır..* S.Rəhimov. *Kənddə olmuş hər bir hadisənin, salınan hər bağın, əkilən hər ağacın, tikilən hər evin tarixçəsini* [Xoşqədəm nənədən] *soruşardılar.* S.M.Qədirzadə.

2. Həyatın adi qaydasını, normal gedişini pozan iş, qəziyyə. *Beynəlxalq hadisə.* – *Bu altı ilin içərisində bir çox hadisələr baş vermişdi.* S.Hüseyn. [İdris] *dərhal polk komandiri qarşısında hərbi salama durub, hadisə haqqında qısa raport verdi.* Ə.Məmmədxanlı.

3. Əhvalat, vaqiə, macəra. *Başıma belə bir hadisə gəlib.* – *Danabaşlar kəndinin xarakter hadisə və tipləri seçilmiş, ümumiləşdirilmişdir.* M.İbrahimov. *Mehman .. maraqlı hadisələr söylər, gülməli nağıllar danışar, ötüb-keçənlərdən söhbət salar, kənddəki bəzi*

*arvadların qoçaqlığından ürəkdolusu deyərdi.* Ə.Vəliyev.

**HAF** *is. zool.* Gecələr çox iti uçan, işığa gələn uzunxortumlu kəpənək.

◊ **Haf kimi** – gözlənilmədən, cəld, özünü birdən çarparaq. *Qasid gəldi haf kimi; İncəlmişdi sap kimi; Gözlə, yarın qəlbini; Qırma çini qab kimi.* (Bayatı).

**HAİL**[1] *is.* [*ər.*] *köhn.* 1. Dəyişmiş, dəyişilmiş, dəyişdirilmiş.

2. Maneə.

3. Çəpər, hasar.

4. *məc.* Əngəl.

**HAİL**[2] *sif.* [*ər.*] *köhn.* 1. Qorxunc.

2. Azman, nəhəng.

**HAİZ** *sif.* [*ər.*] *köhn.* 1. Sahib, yiyə.

2. Əhatə edən.

**HAFİZ** *is.* [*ər.*] *köhn.* 1. Qoruyan, saxlayan, mühafizə edən.

2. Quranı əzbər bilən adam.

**HAFİZƏ** *is.* [*ər.*] Bir şeyi zehnində, yadında saxlama və yenidən təsəvvüründə canlandırma qabiliyyəti; yaddaş. [Yusif:] *O günlər hamısı bir-bir mənim hafizəmdədir.* S.Rəhman. [Qədirin] *çox qəribə hafizəsi var idi.* Ə.Sadıq.

**HAFİZƏLİ** *sif.* Yaxşı hafizəsi, yaddaşı olan; yaddaşlı. *Salmanın verdiyi məlumatlardan Maya onun gözəl hafizəli və ayıq fikirli adam olduğunu görürdü.* M.İbrahimov.

**HAFİZƏSİZ** *sif.* Hafizəsi, yaddaşı olmayan və ya zəif olan; yaddaşsız, unutqan, huşsuz. *Hafizəsiz qoca.*

**HAFİZƏSİZLİK** *is.* Hafizəsi, yaddaşı olmayan və ya zəif olan adamın halı; yaddaşsızlıq, unutqanlıq, huşsuzluq. [Cinayətov:] *Bay sənin... – deyə donquldandı. Öz hafizəsizliyini söydü.* Mir Cəlal.

**HAKƏZA** *zərf* [*ər.*] *köhn.* Beləcə, bu surətdə.

**HAKİM** *is.* [*ər.*] 1. *hüq.* Məhkəmə orqanlarında baxılan iş haqqında hökm və ya qərar çıxaran vəzifəli şəxs. *Xalq hakimi. – Elə bil Zeynal çox xətrini istədiyi bir adamın yox, hakimin suallarına cavab verirdi.* B.Bayramov.

2. *idm.* Oyunda, yarışda hakimlik edən şəxs. *Futbol hakimi. Hakimin qərarı. Beynəlxalq dərəcəli hakim. – Hakimlər əllərindəki* [saniyəölçənləri] *hazır tutub, diqqətlə gözləyirdilər.* H.Seyidbəyli.

3. *tar.* Bir ölkənin başında duran, onu idarə edən şəxs (padşah, hökmdar, xan və s.). *Gəncənin hakimi, Qızıl Arslandan aldığı məktubu böyük şair Nizamiyə göstərib dedi..* M.S.Ordubadi. *Şahlıq səltənətindən şah Təhmasib qovuldu; Səlim oğlu Süleyman Bağdada hakim oldu.* B.Vahabzadə. // *Sif. mənasında.* Hakim təbəqələrə mənsub olan, hakimiyyət başında duran, hökmranlıq edən, ağalıq edən. *Hakim siniflər. – Hakim təbəqələr pul və dövlət gücünə harınlıq edərək nə qədər ismətli və həyalı ailələri dağıtmışlar.* M.İbrahimov.

◊ **Hakim kəsilmək** – hakim olmaq, təsiri altına almaq. *Mahnı onların bütün varlığına hakim kəsildi.* Ə.Məmmədxanlı. *Mənim öz könlümdə doğulan eşqim; Hakim kəsilibdir könlümə indi.* B.Vahabzadə. **Hakim olmaq** – əlinə keçirmək, özününkü etmək, özünə tabe etmək. *Hakim olduq, nəhayət; Yerə, göyə, dənizə.* M.Müşfiq. // Məc. mənada. *Bu axşam Zərəngiz Zakirin ürəyinə də hakim oldu.* H.Seyidbəyli.

**HAKİMİYYƏT** *is.* İdarə etmək hüququ, siyasi hökmranlıq. *Hakimiyyətin ilk illəri. Hakimiyyəti ələ keçirmə. Hakimiyyət başına gəlmək.* – [Abbas:] *Mən də buna qarşı üsyan elədim, ey Afşin, çünki gördüm ki, hakimiyyətin məhvəri türk qoşun başçılarından Aşnasın əlindədir..* Ə.Məmmədxanlı. // Dövlət orqanlarının hüquq və səlahiyyətləri.

2. Dövlət idarə orqanları, hökumət.

**HAKİMLİK** *is.* 1. B a x **hakimiyyət**.

2. *idm.* Hakimin (2-ci mənada) öz vəzifəsini ifa etməsi. *O, dəfələrlə beynəlxalq yarışların hakimliyində iştirak etmişdir.*

**HAQQ**[1] [*ər.*] 1. *sif.* Doğru, düz, düzgün, həqiqi. *Haqq iş. – Nahaq söz od vurar qəlbə, fəqət haqq söz keçər daşdan.* S.Vurğun. *Bu haqdır, ağladıqca; Kişi qeyrətsiz olur.* B.Vahabzadə. // *is.* Ədalət, doğruluq, düzgünlük, düzlük, insaf. *İnsafı tərk edib, haqqı unutdu; O səni yumruğa, qapaza tutdu.* S.Vurğun.

2. *is.* Hüquq, ixtiyar. *Nə üçün kişilərin istədikləri zaman arvadlarını çıxarıb qovmağa haqqı olur, arvadların öz ərlərindən boşanmaq, başqa ərə getməyə haqqı olmayır?* S.Hüseyn.

3. *is.* Gördüyü işin müqabilində birinə verilməli olan pul, muzd və s. *Bir müddət işlədikdən sonra bəy* [Nəbinin] *haqqını kəsir.* "Qaçaq Nəbi". *Münsif malı böləndən sonra haqqını alıb getdi.* (Nağıl). // Üzvü olduğu bir təşkilata və ya bir şeydən istifadə üçün verilməli olan pul, məbləğ. *Üzvlük haqqı. Kirayə haqqı. – Ev sahibi ilə görüşdüm, salamatlaşdım, mənzil haqqını artıqlığınca verdim və çıxdım küçəyə.* C.Məmmədquluzadə.

4. Nisbət şəkilçiləri ilə: barədə (barəsində), xüsusda (xüsusunda) və i.a. *Ailəsi haqqında fikirləşmək.* – [Firidun Südabəyə:] *Açıq deyim ki, sizin haqqınızda qəti bir qərara gələ bilmirəm.* M.İbrahimov.

5. *is.* İxtiyar, hüquq, əsas. *Bu işə qarışmağa onun haqqı yoxdur. – Əvəzin oğlundan böyük şey ummağa haqqı var idi.* Ə.Vəliyev. *Aynanın təəccüb etməyə də haqqı var idi.* İ.Əfəndiyev.

◊ **Haqq oldu** – əcəb oldu, yerində oldu, yaxşı oldu. *Dərdli Kərəm deyər: – Necə olur halım; Sənə lap haqq oldu, ay qanlı zalım.* "Əsli və Kərəm". **Haqq vermək** – 1) təsdiq etmək, doğru saymaq, düzgün, haqlı hesab etmək. [Bəhram:] *Ah, Fitnə, sözünə indi verdim haqq; Neyləyim ki, səni qurutdu torpaq...* A.Şaiq; 2) haqlı olduğunu təsdiq etmək. *Şükür indi Güləliyə haqq verirdi.* S.Hüseyn. **Haqqına yetmək (çatmaq)** – cəzasını almaq, cəzasına çatmaq. *Haqq yolunda didərgini; Haqqına yetir, ay Allah!* M.Araz.

**HAQQ²** *is.* [*ər.*] 1. Allah, Tanrı. *Tək-tək ayılan varsa da, haqq dadıma çatsın; Mən salim olum, cümlə cahan batsa da, batsın.* M.Ə.Sabir. [Qurban:] *Nə deyim, haqqın kəraminə şükür.* Ə.Haqverdiyev.

2. **Haqqı** şəklində – and olsun, and içirəm. [Nənəxanım:] *Ay kişi, atanın goru haqqı heç zadım yoxdur. Nəyim var ki, ay başıdaşlının oğlu?* Çəmənzəminli. [Leylək Ələmdar:] *Qurani-mürsəl haqqı, mənim bu dükanı dağılan kişinin boğulmağına əsla .. gümanım gəlməz.* S.Rəhimov.

**HAQQ-ƏDALƏT** *is.* [*ər.*] Ədalət, insaf. *Səninləyəm, haqq-ədalət, səninləyəm; Milli qürur, milli qeyrət, səninləyəm*! M.Araz.

**HAQQ-HESAB** *is.* [*ər.*] 1. Hər hansı hesablamanın nəticəsi; hesablama, hesab. *Hamı işdən çəkilib çıxdığı halda, mühasib çıxmaq istəmir və əlindəki haqq-hesabı başa çatdırmağa çalışırdı.* S.Rəhimov. *Zülfüqar çox tutqun idi. Haqq-hesab düz gəlmədiyi üçün hirslənir, dodağını gəmirirdi.* B.Bayramov.

2. Hesabat. ..*Katib haqq-hesab məruzəsində Gülyanağın adını çəkdi, onu .. təriflədi.* Ə.Vəliyev. [Muxtar Şahinə:] *Durub bir sənə də haqq-hesab verim?* B.Bayramov.

3. Say-hesab. *Professorun Mehman haqqında olan tərifləri haqq-hesaba gəlməz oldu.* S.Rəhimov.

◊ **Haqq-hesab çəkmək** – 1) hesabat tələb etmək; 2) hesablamaq, hesab etmək, saymaq. [Məzahir Qönçəyə:] *Dünən də bir abbasımı kəsmisən, haqq-hesabı düz çək, sonrası yaxşı olmaz.* B.Bayramov; 3) *məc.* qisas almaq, öc almaq, hesablaşmaq. *O bizimlə haqq-hesab çəkir.* – [Koroğlu:] *Çək atları, yəhərlə, gedib, Həsən xanla haqq-hesabımızı çəkək.* "Koroğlu". **Haqq-hesabı çürütmək (üzmək)** – 1) aralarında olan məsələni qəti həll edib qurtarmaq. [Cahandar ağa] *Molla Sadıqla birdəfəlik haqq-hesabı çürütmək istəyirdi.* İ.Şıxlı; 2) *məc.* əvəz çıxmaq, intiqam almaq, öc almaq, hesablaşmaq. [Ağagül Nəcəf bəyə:] *Təəssüf ki, səninlə haqq-hesabı çürütməyə vaxt qalmadı, dayı!* Ə.Məmmədxanlı. **Haqq-hesabını vermək** – işdən qovmaq, çıxarmaq. [Yaşlı kişi:] *Əgər həmin qulluqçu ikinci dəfə də belə bir unutqanlıq etsə idi,* [tacir] *haqq-hesabını verməklə "xoş gəldin" – deyib qovardı.* S.Hüseyn.

**HAQQ-NAHAQ** *zərf* [*ər.* həqq və *fars.* na] Haqlı olub-olmadığından asılı olmayaraq; istər haqlı olsun, istər haqsız. [Zeynəb] *hər hansı bir məsələ olursa olsun, haqq-nahaq yoldaşlarının tərəfin saxlardı.* Qantəmir. // Yerli-yersiz. *Haqq-nahaq danışmaq.* – [Yaşlı kişi:] [Şirinnaz] .. *haqq-nahaq qəhqəhə çəkib gülür, məni də güldürürdü.* S.Hüseyn.

**HAQQ-SAY** *is.* [*ər.*] Zəhmət, əmək. *Bu mədəndə saç ağartmış ustanın, düzü; Otuz illik haqqı-sayı, əməyi vardı.* Ə.Cəmil. // Çəkilən zəhmət, edilən yaxşılıq. *Valideynlərin haqq-sayı. – Ey qəm, yolun uğurlu, fəqət haqq-say qalır; Boşdur yerin ürəkdə, yaxın mehriban kimi.* Şəhriyar.

◊ **Haqq-say itirmək** – edilən yaxşılığı itirmək, nankorluq etmək.

**HAQLAMA** "Haqlamaq"dan *f.is.*

**HAQLAMAQ** *f.* Yüyürüb çatmaq, dalınca qaçıb yaxalamaq, başının üstünü almaq. *Bazarçaydan gələn dəstə banditləri haqlamışdı.* Ə.Vəliyev. *Elə bu anda ağacdan bir başqasının da atılıb qaçmaq istədiyini və "Qoçağ"ın onu haqladığını gördüm.* M.Rzaquluzadə. // *məc.* Çatmaq, yetmək, yetişmək. [Məmmədbağır] *evlənərkən yaşı qırxı haqlamışdı.* S.Hüseyn.

**HAQLAŞMA** "Haqlaşmaq"dan *f.is.*

**HAQLAŞMAQ** *f.* Hesablaşmaq, haqq-hesabı çürütmək, haqq-hesab çəkib üzülüşmək.

**HAQLI** *sif.* Düz deyən, düzgün fikirləşən, düz hərəkət edən, səhv etməyən (*haqsız* əksi). *Xan, arvadının sözlərinin haqlı olduğunu anladı.* Çəmənzəminli. *Mühəndis etirafında haqlı idi.* Ə.Sadıq. // Doğru, düz, düzgün, yerində, həqiqətə əsaslanan. *Haqlı təklif. Haqlı tələb. Haqlı etiraz.* – [Nadir] *..özünü töhmətləndirib, Məcidin hərəkətini haqlı* (z.) *görərək onun evləndiyini ağıllı iş hesab edirdi.* B.Talıblı. *Getmədi, getmədi qulaqlarından; Oğlunun dediyi o haqlı sözlər.* B.Vahabzadə.

◊ **Haqlı çıxarmaq** – bəraət qazandırmaq, doğrultmaq. *Əmir bu sözləri dedikdən sonra qismən sakit olmuşdu. O, qadınını haqlı çıxarmağa və öz vicdanını qane etməyə təlәsirdi.* M.S.Ordubadi. **Haqlı çıxmaq** – bir mübahisədə, tələbdə, fikirdə və s. doğru olduğu aşkar olmaq.

**HAQLILIQ** *is.* Fikirdə, mühakimədə, hərəkətdə və s. düzlük, düzgünlük, doğruluq; haqlı olma; haqq, ədalət. *Öz işinin haqlılığına inanmaq.*

**HAQSEVƏR** *is.* Haqqı, düzgünlüyü, doğruluğu sevib müdafiə edən adam. // Sif. mənasında. [Cabbar:] *Sən özün haqsevən bir adamsan, bizi də yaxşı tanıyırsan, bilirsən də ki, Səfər bizim namusumuza və qeyrətimizə toxunub.* B.Talıblı.

**HAQSIZ** *sif.* və *zərf* 1. Haqq və insafa uyğun olmayan; ədalətsiz, nahaq, əsassız. *Haqsız iddia. Haqsız cəza. – Mürsəqulu .. haqsız işə razı olmayan bir adam idi.* S.Hüseyn. [Tahir:] *..Mən özümdən başqa hamını günahkar hesab eləməkdə haqsızam.* M.Hüseyn. // Əbəs, nahaq, bihudə, boş yerə. [Rüstəm:] *Haqsız qanlar axmasın deyə; Səyavuşla Piran gəldi bir rəyə.* H.Cavid. ☐ **Haqsız yerə** – əbəs, nahaq, heç bir ehtiyac olmadan, boş yerə. [Qanpolad:] *Səlim! Burax, haqsız yerə tökmə qan.* H.Cavid. *Xanım haqsız yerə* [Sarıköynəyi] *söyüb-danlamağa, döyüb-incitməyə başlayır.* S.Hüseyn.

2. Heç bir haqqı, hüququ olmayan.

**HAQSIZLIQ** *is.* 1. Haqq və ədalətə uyğun olmayan hal; ədalətsizlik, insafsızlıq. *Nəbi kiçik yaşlarından haqsızlığı sevməzdi.* "Qaçaq Nəbi".

2. Hüquqsuzluq, ədalətsizlik. *Hər yerdə, hər mühitdə haqsızlığın, qolugüclülüyün .. əleyhinə çıxışlar olurdu.* S.Hüseyn. [Qulu] *bilirdi ki, haqsızlıq və rüşvət yuvası olan* [çar] *məhkəmələri də ona kömək etməyəcəkdir.* A.Şaiq.

**HAQVERMƏZ** *sif.* Başqasını işlədib haqqını verməyən, haqqını kəsən; istismarçı. *Məlik tacir haqverməz adamdı.* (Nağıl).

**HAL**¹ *is.* [*ər.*] 1. Hər hansı bir səbəbdən, şəraitdən doğan vəziyyət, keyfiyyət. *Xəstənin halı yaxşıdır. – Hicrin edibdi könlümü bərbad, ağlaram; Çoxlar tutar bu halıma irad, ağlaram.* Natəvan. [Ceyranın] *keçmiş halı ilə indiki halını müqayisə edirdim.* S.Hüseyn. ☐ **Belə halda** – belə vəziyyətdə. *Belə hallarda düşüncə və kədəri dostlara danışmaq və onların sərəncamında olan imkanlardan istifadə etmək lazımdır.* M.S.Ordubadi. **Bu hal** – bu vəziyyət. [Zeynal:] *Öz həyatını müəyyən bir şəklə salmalı idi. Bu hal beləcə davam edə bilməyəcəkdi.* S.Hüseyn. *Ayıq ol, böylə davam etsə bu hal; Millətə qorxuludur istiqbal.* A.Şaiq. // İnsanın cismani vəziyyəti, yaxud əhvalı, əhval-ruhiyyəsi. *Məstlik halı. Yuxulu halda.* – [Mehriban] *xüsusilə çocuğu doğduqda olduqca ağır və böhranlı hallar keçirmişdir.* S.Hüseyn.

2. Güc, qüvvət, taqət. [Rəsul:] *Anacan, dayanmağa halım yoxdur, gərək mən gedəm.* "Aşıq Qərib". ☐ **Hal qalmamaq** – gücdən düşmək, taqətdən düşmək, üzülmək. *Ağlamaqdan qalmamışdı məndə hal.* H.Cavid.

3. *fiz.* Maddəni təşkil edən hissəciklərin yerləşməsinin, qarşılıqlı əlaqəsinin və hə-

rəkətinin xarakteri. *Maddənin yeni keyfiyyət halına keçməsi. – ..Cəmi heyvanat bir dərəcə donmaq halına çatanda yarıdiri olurlar, yarıölü olurlar..* C.Məmmədquluzadə.

4. Vaxt, an, ləhzə. ☐ **Bu halda** – bu anda, bu vaxt. *Bu halda yoldaşım içəri girdi. – Bu halda qapı döyüldü.* E.Sultanov. *Bu halda bayır qapıdan Sultan bəy daxil olur.* Ü.Hacıbəyov. **O halda** – onda, o zaman. *O halda bizdən kömək gözləmə. O halda mən gəlməyəcəyəm.*

5. *qram.* İsmin başqa cümlə üzvlərinə münasibətini bildirən və hallanma formalarında ifadə olunan qrammatik kateqoriya. *Azərbaycan dilində ismin altı halı vardır. Adlıq hal.*

◊ **Hal aparmaq** – özündən getmək, huşunu itirmək, ürəyi keçmək. **Hal əhli** – kef çəkməyi, vaxtını kefdə keçirməyi sevən adam haqqında. *Seyyid, yürü, məlum ki, hal əhli deyilsən; Dün şəb səni mən mədrəsədə qal ilə gördüm.* S.Ə.Şirvani. **Hal tutmaq** – b a x **hal-əhval tutmaq**. *Atamız doyunca xoşlandı bizdən; Sonra da hal tutdu hər birimizdən.* S.Vurğun. **Hala gəlmək** – özünə gəlmək, gücü, qüvvəti, taqəti özünə qayıtmaq, dirçəlmək. *..Hərəmiz bir istəkan çay içəndən sonra bir qədər hala gəldik.* C.Məmmədquluzadə. [Piri baba:] *Qoy gəzsin, yesin, içsin, hala gəlsin.* S.S.Axundov. **Haldan çıxar(t)maq** – normal halından çıxarmaq, hirsləndirmək. *Kətxuda çox qorxaq adamdı. Uryadnikin vurulmağı onu büsbütün haldan çıxartmışdı.* M.Hüseyn. **Haldan çıxmaq** – hirslənmək, özündən çıxmaq. [Mahmud:] *Sən olasan ölənlərinin goru, məni bu hirsimin tutmuş vaxtında haldan çıxartma!* Ə.Haqverdiyev. **Haldan düşmək** – üzülmək, çox yorulmaq, əldən düşmək. [Böyük oğul:] *Kişi gözləməkdən lap haldan düşdü.* Qantəmir. [Musa] *..qızıl mədəninə yetişərkən haldan düşdü.* S.Vəliyev. **Haldan-hala düşmək** – halı pozulmaq, halı qarışmaq. *O, oxuduqca ingilisin siması haldan-hala düşür və acığından dilini, dodağını çeynəyirdi.* Qantəmir. **Haldan salmaq (etmək)** – üzmək, çox yormaq, əldən salmaq. *Qılınc kimi kəsən külək keşikçiləri haldan salmışdı.* S.Vəliyev. **Halı dönmək (dəyişmək)** – b a x **halı pozulmaq**. *Ancaq bilmədim ki, bu necə işdi; Əllərim titrədi, halım dəyişdi.* M.Rahim. **Halı qarışmaq (dəyişmək)** – normal halından çıxmaq, qanı qaralmaq, pozulmaq. *Tapdılar orada qırıq qandalı; Qubernator ağanın qarışdı halı.* H.K.Sanılı. **Halı pozulmaq** – 1) b a x **halı qarışmaq;** 2) halı daha da pisləşmək, ağırlaşmaq. *Xəstənin halı pozuldu. – Aslanın halı elə pozulmuşdu ki, bıçaq vursaydın qanı çıxmazdı.* S.Vəliyev. **Halına ağlamaq** – 1) b a x **halına qalmaq**. *Camaatın halına ağlayan, onun dərdinə dərman axtaranların nəsli kəsilir, izi itirilirdi.* H.Sarabski; 2) b a x **halına yanmaq (acımaq)**. [Mühəndis:] *Eh, başıma gələnləri bilsən, halıma ağlarsan.* S.Rüstəm. **Halına qalmaq (ağlamaq)** – qeydinə qalmaq, qayğısını çəkmək, qayğısına qalmaq, halını düşünmək. *Ər dərdqəmin çəkmə, sən öz halına ağla; Canı bəcəhənnəm!* M.Ə.Sabir. *Kosa, yanında dayandığı xəstənin halına qalır və onunla birlikdə tərpənirdi.* S.Rəhimov. **Halına təfavüt etməmək** – halına heç bir təsiri olmamaq, halında heç bir dəyişiklik əmələ gəlməmək, heç bir fərqi olmamaq. [Nəbi:] *Cəbi, sən öləsən, heç halına təfavüt etmir.* S.S.Axundov. **Halına yanmaq (acımaq)** – yazığı gəlmək, acımaq, şəfqət göstərmək, ürəyi acımaq, canıyananlıq etmək. [Mirzə Tağı:] *Biçarə İran camaatı, .. sizin halınıza yanıram, sizin halınızı yüngülləşdirməyə səy edirəm.* C.Cabbarlı. *Gülnaz yağışlı gecəni, oğlanın bir köynəkdə başdan-ayağa islandığını xatırladı və onun halına acıdı.* Q.İlkin. **Halından çıxmaq** – özündən çıxmaq, hirslənmək, müvazinətini itirmək. *Usta bir də halından çıxdı, az qalmışdı yenə dava düşsün.* Çəmənzəminli. **Halını qatmaq** – qanını qaraltmaq, özündən çıxarmaq, hirsləndirmək. [Məşədi Ağakişi:] *Siz öləsiz,* [atlılar] *düz Hacı Namazalının xırmanına sürdülər. Kişinin halını qatacaqlar.* C.Məmmədquluzadə. **Halını pozmaq** – halına təsir etmək, adi halından çıxarmaq, hirsləndirmək. *Lakin bu söz də maarif müdirinə təsir etmədi, halını pozmadı.* M.İbrahimov. **Hər halda** – necə olsa, necə olursa olsun. *Cahandar ağa Əşrəfin bu işlərinə necə münasibət bəsləyəcəyini bilməsə də, hər halda xoşagəlməz .. söhbət eşitmək istəmirdi.* İ.Şıxlı. **Nə halda** – necə, nə cür, nə

vəziyyətdə. [Məşədi İbad:] *İndi gördünmü iş nə haldadır?* Ü.Hacıbəyov.

**HAL**[2] b a x **al**[3] (bəzən “hal anası” şəklində işlənir). *Hal hər şeyi tərsinə eləyir. Tərsinə iş görən qadına deyərlər: hal cinsisən? Bir adam tutduğu halı yazığı gəlib buraxsa, hal onun yeddi arxadan dönəninə dəyməz.* (Əsatir). *..Bəzi vaxt söhbət cindən, şeytandan, divdən, hal anasından düşərdi.* S.S.Axundov.

**HALA** *zərf* [*ər.*] *klas.* İndi, indi də, indiyədək, hələ də. *Mənə derlərdi əvvəl, bir mələkdir sevdiyin. Hala; Görənlər sən fəqirə göydən enmiş bir bəla derlər.* Füzuli.

**HALAL** *sif.* [*ər.*] 1. İslam dininin ehkamlarına görə yeyilməsinə, işlədilməsinə və ya özünə mal edilməsinə icazə verilən (*haram* əksi). // *köhn.* Kəbinli, nikahlı; qanuni. *Əsmər yenə şəriətin hökmüncə* [Məmmədbağırın] *halal arvadı olub qalırdı.* S.Hüseyn. // *İs. mənasında. köhn.* Kəbinli arvad. [Cavad bəy:] *Müqabilinizdə oturan arvad ağıllı və dövlətli bir şəxsin halalıdır.* İ.Musabəyov.

2. *məc.* Zəhmətlə, namusla, təmiz əməklə, qanuni yolla qazanılmış, əldə edilmiş. [Yaşlı kişi tacirə:] *Sən mənim xeyir-bərəkətimi qaçıracaqsan, sən mənim halal malıma haram qatacaqsan!.. – deyərək uzun-uzadı deyinərdi.* S.Hüseyn. *Onun halal çörəyilə qüvvət gəlir ürəklərə; Bərkiyərək polad olur övladımın sümükləri.* S.Rüstəm. // *məc.* Halal şey qazanmaq, əldə etmək üçün çəkilən, sərf edilən. *İmran kişinin nəzərində Dilman başqalarının halal əməyi ilə öz eyiblərini örtən bir adamdı.* M.Hüseyn.

3. **Halaldır** şəklində – b a x **halal olsun!**

◊ **Halal etmək** *köhn.* – borcunun, yaxud vaxtilə etmiş olduğu pisliyin üstündən keçmək, bağışlamaq. [Xan:] *Arvad, ay gözəl arvad, bircə asudəlikdə qədrini bilmədim. Məni halal elə.* Çəmənzəminli. [Səriyyə:] *Ah! Hüsniyyə.. Məni halal elə, doqquz il səninlə bir məktəbdə bacılıq etmişəm.* C.Cabbarlı. **Halal xoşun(uz) olsun!** – b a x **halal(ın) olsun!** [Əliməmməd eşikağasına:] *Elə bu yüz əşrəfini gətirə bildim, sənə peşkəşdir. Yuxarıda Allah, yerdə sən, halal xoşun olsun.* Çəmənzəminli. **Halal(ın) olsun!** – bir şeyi könüllü, əvəzsiz olaraq birinə verəndə deyilir – haIaldır, halal xoşun olsun. *Halal olsun İskəndərə; Unudub dünya cifəsin; Tabe olub peyğəmbərə..* Aşıq Ələsgər. **Halal süd əmmiş** – namuslu, düz, təmiz vicdanlı. [Kərbəlayı:] *Doğrudan arvad, bir halal süd əmmişini tapsa idin, yaxşı olardı.* Çəmənzəminli. [Südabənin anası:] *Oğlum, Firidun, sən mənim oğlumsan, halal süd əmmiş bir adama oxşayırsan.* M.İbrahimov.

**HALALCA** *sif.* 1. B a x **halal** 2-ci mənada. *Hamıdan varlı ikən, hamıdan yoxsul oldum; Halalca dövlətimi haram etdi o, haram.* B.Vahabzadə.

2. B a x **halal** 1-ci mənada. [Məşədi İbad:] *Əşi, mən qızın halalca adaxlısı ola-ola hasarın bu tayında qalım, bir dələduzun birisi də o tayda olsun?!* Ü.Hacıbəyov.

**HALALLAŞMA** “Halallaşmaq”dan *f.is.*

**HALALLAŞMAQ** *qarş.* Ölərkən və ya uzun müddətə ayrılarkən bir-birinin pisliyinin və ya borclarının üstündən keçmək, bir-birini bağışlamaq. *Səfərlə Miraxur Kürün qırağına qədər bir yerdə getdilər, orada halallaşıb ayrıldılar.* Çəmənzəminli. [Səlimi Rza xana:] *..Kəndli öləcəyini gördükdə dostaşna və arvad-uşaqla halallaşmağa başlayır..* M.İbrahimov.

**HALALLIQ** *is.*: **halallıq almaq** – ölərkən və ya uzun müddət ayrılarkən vaxtilə etmiş olduğu pisliyin, yaxud qaytarmadığı borclarının bağışlanmasını xahiş etmək. *Məşədi Əsgərin fikri bu idi ki, çamadan sahibini tapsın və əmanətini özünə rədd edib halallıq alsın.* S.M.Qənizadə. **Halallıq vermək** – ölərkən və ya uzun müddət ayrılarkən birisinin vaxtilə etmiş olduğu pisliyi, yaxud qaytarmadığı borclarını bağışlamaq.

**HALAY** *is.* Dairə, dövrə. □ **Halay vurmaq (qurmaq)** – dövrə vurmaq, halaylamaq. *Göy üzündə bir dəstə qartal qanadlarını geniş açaraq halay vurub hərlənirdi.* M.Rzaquluzadə.

**HALAYLAMA** “Halaylamaq”dan *f.is.*

**HALAYLAMAQ** *f.* Dövrə vurmaq, halay vurmaq, dövrələmək.

**HALBAHAL** *zərf* [*ər.* hal və *fars.* bə]: **halbahal olmaq** – haldan hala düşmək, halı dəyişmək, vəziyyəti gah pisləşib, gah yaxşılaşmaq. *Xəstə halbahal olurdu.*

**HALBUKİ** Bir-birinə zidd olan, bir-birini inkar edən iki fikrin qarşılaşdırıldığı tabesiz mürəkkəb cümlələrdə müstəqil cümlələr arasında əlaqə yaradan bağlayıcı; vəhalonki. [Mansuru] *görə bilmirdim, halbuki başqa yoldaşlarımıza arabir rast gəlirdim.* Çəmənzəminli.

**HALƏ** *is.* [*ər.*] Ayın və bəzi iri ulduzların ətrafında bəzən görünən işıq dairəsi. *Fikrini, qəlbini çalmışdı ələn; Mahtabın sulara düşən haləsi.* S.Vurğun. *Dağıtma gül üzə zülfün ay üzrə halə kimi; Şərabdan bir əsər var ləbində lalə kimi.* Ə.Vahid.

◊ **Halə qurmaq (vurmaq)** – dairə vurmaq, dövrə vurmaq, halqa vurmaq. *Aydınlıq gecədə gözəl bir çeşmənin kənarında cavanlar halə qurub, əyləşib, növbə ilə oxuyub-çalanlara qulaq verirdilər.* Ə.Haqverdiyev.

**HAL-ƏHVAL** *is.* [*ər.*] Vəziyyət, əhval.

◊ **Hal-əhval tutmaq (soruşmaq)** – bax **əhval tutmaq (soruşmaq)** (“**əhval**”da). [Şeyx] *hal-əhval tutub, bardaş qurdu.* Qantəmir. *Nəcəfalı yaxınlaşıb* [katibə] *salam verdi, əl tutub, hal-əhval soruşdu.* B.Bayramov.

**HALƏLƏNMƏ** “Halələnmək”dən *f.is.*

**HALƏLƏNMƏK** *f.* Ətrafında bəzən işıqlı dairə əmələ gəlmək (Ay və bəzi iri ulduzlar haqqında). [Pərşan] *göylərin axşam parıltısında halələnmiş* (f.sif.) *ay kimi işıq verirdi.* M.İbrahimov.

**HALƏT** *is.* [*ər.*] *klas.* Hal, vəziyyət. *Naçalnik elə bir halətdə mənim üzümə baxırdı ki, deyirdim, bu saat durub məni yeyəcək.* C.Məmmədquluzadə. *Evə dönərkən anası* [Mərdanda] *başqa halət gördü.* Çəmənzəminli.

**HALƏTİ-RUHİYYƏ** *is.* [*ər.*] *klas.* bax **əhval-ruhiyyə**. [Yaşlı kişi:] *Bədbincə bir haləti-ruhiyyə məni qapladı.* S.Hüseyn.

**HAL-HAZIR** *is.* İndiki vaxt, indiki zaman, hazırkı vaxt, bu an, bu saat, əlan. [Çopo:] *Keçmişin təcrübəsi hal-hazır üçün faydalıdır.* Çəmənzəminli.

**HALİ** *is.* [*ər.*] Bir hadisə, iş haqqında məlumatı, xəbəri olan; xəbərdar, agah. *Haliyəm ellərin mən cümləsindən; Gecə yatmaz bir-birinin bəhsindən.* Aşıq Ələsgər. □ **Hali etmək** – xəbərdar etmək, agah etmək, məlumat vermək, bildirmək. *Yolda kəndlilər Nəbini işdən hali edirdilər.* “Qaçaq Nəbi”. [Fəxrəddin bəy:] *Allah xətrinə, tez məni hali eylə.* N.Vəzirov. **Hali olmaq** – xəbəri olmaq, agah olmaq, xəbərdar olmaq, bilmək, öyrənmək. *Abbas Pəri xanımın kağızını oxuyub məzmunundan hali olandan sonra bağa gəldi.* “Abbas və Gülgəz”. *Nərminə vəziyyətdən hali olub doyunca güldü.* B.Bayramov.

**HALQA** *is.* 1. Çənbər, qurşaq, dairə şəklində gərək (əsasən metaldan olur). *Qaratoyuq ayağını cələdən çəkdikdə qıl halqa daralıb onu bənd edirdi.* S.S.Axundov. *Səlim də quşları tutmaq, ayaqlarına yüngül alümin halqa taxmaq işində elmi işçilərə kömək edirdi.* M.Rzaquluzadə. // Kilid əvəzinə və ya qıfılı keçirmək üçün qapıya (bəzən də pəncərəyə) vurulan həmin formada alət. *Böyük qapının böyük halqası olar.* (Ata. sözü). *..Durdum, getdim, ara qapını örtdüm və gördüm ki, hələ möhkəm qarmağı da var, qarmağı da keçirtdim halqaya, soyundum və yıxıldım yatdım.* C.Məmmədquluzadə. // Bəzək üçün və ya evlilik simvolu kimi barmağa taxılan həmin formalı əşya; qaşsız üzük. *Göylərin sanki bu Göygöl kimidir; Halqa üstündəki zümrüd kimidir.* M.Müşfiq. [Fitnə:] *Biz çoxdan bağlıyıq bir-birimizə; Nə gərək bu qızıl halqalar bizə!* A.Şaiq. // *Adətən cəm şəklində, idm.* Asılmış iki çənbərdən ibarət gimnastika aləti. // Ümumiyyətlə, halqaya, çənbərə oxşayan hər şey.

2. Zənciri əmələ gətirən dairəvi hissələrdən hər biri. *Dövlət quruluşu belədir, məmləkətdə qoyulmuş qanunların hamısı zəncirin halqası kimi bir-birinə bənd olubdur.* M.S.Ordubadi.

3. Həmin formada olan hər bir şey. *Tüstü halqaları. – Bir anda bütün ətrafda yüzlərlə lampoçka yandı, qaranlığın halqası parçalandı.* M.İbrahimov. // Dairə, dövrə. *Getdikcə oynayanların halqası böyüyürdü.* S.Hüseyn. □ **Halqa vurmaq** – dairə vurmaq, dövrə vurub oturmaq. *Qoca ləzgi bir daş üzrə oturmuş; Ətrafında kənd əhli halqa vurmuş.* A.Səhhət. *Dəstə halqa vurub oturmuşdur.* S.Rəhimov. // Dövrələyən, mühasirəyə alan, qapayan şey; mühasirə. *Düşmən halqasını yarıb keçdilər.* □ **Halqaya almaq** – mühasirəyə almaq, dövrələmək, əhatə etmək.

[Fərid:] *Böyük bir izdiham sarayı halqa içərisinə aldı.* M.Hüseyn. *Bir neçə atlı şimşək sürətilə xanı və bəyləri halqaya almış düşmənlər üzərinə şığıdı.* M.Rzaquluzadə.

4. B a x **hədəqə**. [Gülnaz] *sözünün dalını deyə bilmədi. Halqasından çıxmaqda olan ala gözlərini Firiduna dikib susdu.* M.İbrahimov.

**halqa-halqa** *sif.* Halqalar şəklində, burum-burum. *Kərbəlayı Qurban ayaqlarını uzadıb, çubuğu almışdı damağına və hərdənbir ağzından halqa-halqa tüstü çıxarırdı.* Çəmənzəminli. [Nəbi:] *Həcərin saçları dalğa-dalğadır; İpək birçəkləri halqa-halqadır.* S.Rüstəm.

**HALQALAMA** "Halqalamaq"dan *f.is. Balıqları halqalama. – ..Quşları halqalama işi ilə mərkəzi halqalama bürosu məşğuldur.* "Zoologiya".

**HALQALAMAQ** *f.* 1. *xüs.* Yerdəyişmə istiqaməti və sürəti, ömürlərinin uzunluğu və s. üzərində elmi müşahidə aparmaq məqsədilə quşların ayağına və balıqların quyruğuna nişanlanmış halqa taxmaq. *Köçəri quşların ayaqlarını halqalamaq.*

2. Ziyanvericilərdən qorumaq üçün ağacların gövdəsinə dairəvi şəkildə qatran və s. sürtmək.

**HALQALANMA** "Halqalanmaq"dan *f.is. Balığın quyruğunun halqalanması. – Qoruqda quşların halqalanması, miqrasiyası, həyat tərzi, bir-biriləri və ətraf mühitlə qarşılıqlı münasibətləri və s. problemlər ətrafında elmi iş aparırlar.* "Elm və həyat".

**HALQALANMAQ** *məch.* 1. Quşun ayağına və ya balığın quyruğuna halqa keçirilmək. *Halqalanmış* (f.sif.) *quş başqa bir yerdə öldürüldükdə quşun ayağında olan halqa göstərilən ünvan üzrə lazımi yerinə göndərilir, .. quşun vurulduğu yer və tarix xəbər verilir.* "Zoologiya".

2. Dövrəyə alınmaq, mühasirəyə alınmaq, dövrələnmək.

3. Halqa kimi olmaq, halqa şəklinə düşmək, burum-burum olmaq. [Kərəm:] *Oynadı, külahı düşdü sərindən; Halqalandı zərif tellər, oynadı.* "Əsli və Kərəm". *Yel əsdi, meşə dindi; Sərvlər silkələndi; Suya qağayı endi; Halqalandı dalğalar.* N.Xəzri.

4. *məc.* Təəccübdən, heyrətdən və s. bərələ qalmaq. *Qonşumun gözləri halqalandı. Birinci dəfə idi ki, o, qızından belə "iftira" eşidirdi.* S.Rüstəm.

**HALQAŞƏKİLLİ** b a x **halqavari**.

**HALQAVARİ** *sif.* Halqa, çənbər, çevrə şəklində; dairəvi, halqaşəkilli.

**HAL-QƏZİYYƏ** *is.* [*ər.*] Hadisə, əhvalat, qəziyyə. [İbrahim xan Vaqifə:] *Gedin, görək hal-qəziyyə nə minval üzrədir.* Çəmənzəminli.

**HALLANDIRMA** "Hallandırmaq"dan *f.is.*

**HALLANDIRMAQ** *f. qram.* Hallar üzrə dəyişdirmək. "*Əl*" *ismini hallandırmaq.*

**HALLANMA** "Hallanmaq"dan *f.is. İsmin hallanması.*

**HALLANMAQ** *f. qram.* Hallar üzrə dəyişmək.

**HALLAŞMA** "Hallaşmaq"dan *f.is.*

**HALLAŞMAQ** b a x **hal-əhval tutmaq** ("**hal-əhval**"da). *..Adam həmişə həmsöhbət tapır, bir-birilə hallaşır, "məsələ" öyrənir.* Çəmənzəminli.

**HALLI** *sif.* və *is.* 1. Kefli, az sərxoş. *Məhəbbətdən mey içmişəm, hallıyam.* M.Rahim.

2. B a x **hallıca**.

3. *dan.* Xoşrəftar, xoştəbiət, xoşəhvallı. *Hallı oğlan. – Ovçusun görəndə maral baxışlım; Özü hallı, üzü xallı Sənəm, gəl!* Xəstə Qasım.

◊ **Hallı halına görə** – gücünə, bacarığına, puluna, varına müvafiq, gücü çatdığı qədər, bacardığı qədər. *Kəbin hallı halına görə idi: 51, 101, 201, 301, 501, 1000, 2001 qızıla qədər olardı.* H.Sarabski. *Yol xətti kənd Şuralarının arasında hallı halına görə bölünmüşdü.* S.Rəhimov.

**HALLICA** *zərf zar. dan*. Dolğun (bədənli), koppuş. [Sultan bəy:] *..Mənimki bir hallıca, dulluca arvaddır.* Ü.Hacıbəyov. *..Hallıca, enlikürək bir qadın aralığa çıxdı.* Mir Cəlal.

**HALLÜSİNASİYA** *is.* [*lat.*] *tib.* Qarabasma, gözəgörünmə.

**HALOGEN** *is.* Kimyəvi element, ünsür.

**HALSIZ** *sif.* Zəif düşmüş, əldən düşmüş, üzgün, taqətsiz, yorğun. *Halsız qoca. – Mehriban yorğun və zəif gözlərini açdı. Çox halsız idi.* S.Hüseyn. *Müəllimin rəngi qaçqın;*

*Çox halsızdır, yatağında.* M.Dilbazi. ☐ **Halsız düşmək** – üzgün düşmək, taqətsiz olmaq, bihal olmaq, əldən düşmək. [Xəstənin] *yuxuladığı, ya halsız düşdüyü məlum deyildi.* Mir Cəlal.

**HALSIZCA** *zərf* Halsız halda, bihal, üzgün halda, əldən düşmüş halda. *Xədicə arxası üstə halsızca uzanıb tez-tez nəfəsini çiyinlərilə alıb verirdi.* S.Hüseyn.

**HALSIZLIQ** *sif.* Zəiflik, üzgünlük, bihallıq, taqətsizlik, əldən düşmə. [Nuriyyə:] *Sonra özümdə qəribə bir halsızlıq hiss elədim.* İ.Əfəndiyev. *Ah, istidən sıxılıram; halsızlıqdan yıxılıram.* M.Dilbazi.

**HALVA** *is.* [*ər.*] Yağda qovrulmuş un və doşabdan, bəzən də baldan, şəkərdən bişirilən Şərq şirniyyatı. *Axşam azanı deyilən kimi, mömin müsəlman bilmir ki, nəyə əl uzatsın: çaymı içsin, firnimi yesin, halvadanmı dadsın.* C.Məmmədquluzadə. [Xanməmməd] *..heç bir təklif olmadan süfrədən halva götürüb ağzına qoydu.* Çəmənzəminli. ☐ **Halva çalmaq** – halva bişirmək. [Vaqif:] *Lələ, uşaqlara de, bir yaxşı halva çalsınlar.* Çəmənzəminli. *Telli öz otağında halva çalırdı.* S.Hüseyn. // Şirni ilə küncüd, qoz, fındıq və s.-dən hazırlanan şirniyyat növü. *Küncüd halvası. Qoz halvası.*

◊ **Halvasını çalmaq** – məhvini, ölümünü hazırlamaq. *Millət özü halvasını çaldı ağaların; Sən barı çək əl, şah ilə sultanə dolaşma.* Ə.Qəmküsar.

**HALVAÇI** *is. köhn.* Halva bişirib satan adam. *Halvaçı qızı daha şirin.* (Ata. sözü). *..Şəms axırda bir şəhərə çatdı. Orada halvaçı şəyirdi oldu.* (Nağıl).

**HALVAÇILIQ** *is. köhn.* Halvaçı sənəti; halva bişirib satmaqla məşğul olma. *Əhalinin bir qismi də xırda ticarətlə – halvaçılıq, çörəkçilik, .. baqqallıq, bəzzazlıqla məşğul olardı.* H.Sarabski.

**HAM(M)** *is.* Hürərkən itin çıxardığı səs.

**HAMAM** *is.* [*ər.*] Çimmək üçün isti və soyuq suyu olan xüsusi bina. *Şəhər hamamları. Məhəllə hamamı.* – [Məşədi Qəzənfər:] *Daha kim deyə bilər ki, hamam pis şeydir.* Ü.Hacıbəyov. [Qərənfil:] *İnişil təşəbbüs qaldırdınız ki, hamam tikək, hələ hörgüsü bir arşın qalxmayıb.* İ.Əfəndiyev. // Vanna otağı, hamamxana. [Şirzad:] *Kəsir odur ki, belə gözəl evin mətbəxi və hamamı yoxdur.* M.İbrahimov.

◊ **Hamam kimi** – çox isti yer haqqında. *Ev hamam kimi idi.* Qantəmir. **Hamam suyu ilə dost tutmaq** – asan yolla, heç bir xərc çəkmədən, havayıdan özünə dost qazanmağa çalışmaq.

**HAMAMÇI** *is.* 1. *köhn.* Hamam sahibi, yaxud hamam icarəçisi. *Usta Ağabalanın səsinə hamamçı dik atılıb, az qaldı ocağın üstündə qaynayan pitini töksün..* Çəmənzəminli. *Hamamçı Məşədi Qəzənfər sarı kürkə bürünüb bayır qapının solunda öz yerində əyləşibdir.* Ü.Hacıbəyov.

2. Hamam xidmətçisi (camadar, kisəçi və s.).

**HAMAMÇILIQ** *is.* Hamamçı peşəsi, hamamçının işi-peşəsi. *Camadarın şahlığı hamamçılıqdır.* (Ata. sözü).

**HAMAMXANA** *is.* [*ər.* həmmam və *fars.* ...xanə] Bir ailənin istifadəsi üçün mənzillərdə hamam, vanna otağı. *Sürmə xala Əzizi hamamxanaya salıb mətbəxə qayıtdı və tələsik yemək hazırlamağa başladı.* S.Rəhman.

**HAMAN** [*fars.*] 1. Göz önündə olmayan və ya uzaqda olan bir şeyi və ya şəxsi göstərmək üçün işlədilən əvəzlik – o, özü. *Haman kitab. Haman oğlan.* – *Haman gündən işə başladım.* Qantəmir. *Haman qız bütün səyahətçilərin qəlbini özünə məftun etmişdi.* M.S.Ordubadi.

2. *zərf* Əlüstü, dərhal, o saat, tez. *Aradan keçmədi bir öylə zaman; Bu dönüş Gülnazı sarsıtdı haman.* M.Müşfiq. [Ceyniz:] *Qardaşımın sözləri bir ox olaraq atamın ürəyinə sancıldı, haman bağırdı.* Çəmənzəminli.

**haman-haman** b a x **haman** 2-ci mənada.

**HAMAR** *sif.* [*fars.*] 1. Girintisi-çıxıntısı, kələ-kötürü olmayan; düz (səth haqqında). *Hamar daş. Hamar asfalt yol.* – *Yol enli və hamar idi.* S.S.Axundov. *O qədər hamardır, o qədər hamar; Şahmat taxtasına bənzəyir çəmən.* N.Xəzri.

2. Əziyyətsiz, rahat. *Ovçu-ovçu ha maral; Budu getdi ha maral; Belə can almaq olmaz; Can alırsan, hamar al.* (Bayatı).

**HAMARCA** *sif.* Olduqca hamar, lap hamar, düz. *Hamarca taxta.*

**HAMARLAMA** "Hamarlamaq"dan *f.is.* *İstifadəyə verilən sahələrdə əsaslı surətdə hamarlama işləri görülür.*

**HAMARLAMAQ** *f.* 1. Yerin və ya bir şeyin səthini hamar hala salmaq, hamar, düz etmək, düzləndirmək. *Taxtanı rəndə ilə hamarlamaq. – Dənizin şıltaq ləpələri .. qumu təzədən hamarlayırdı.* H.Seyidbəyli. *Əhməd .. uzun qəlyanı .. kisənin içinə salıb xeyli eşələdi, gözəyarı tütünlə doldurduğunu müəyyən edib çıxartdı. Baş barmağı ilə basıb hamarladı.* İ.Şıxlı.

2. Qarışmış, qırışmış bir şeyi düzəltmək, səliqəyə salmaq. *Saqqalını hamarlamaq. – Qaraşa baxmadan* [Salman] *yaxasını hamarladı, özünü düzəltdi..* M.İbrahimov. *Zöhrə gah mis sənəyin ora-burasını silir, gah da sənəyin qulpuna bağlanmış çatının qotazlarını hamarlayırdı..* Ə.Vəliyev.

**HAMARLANMA** "Hamarlanmaq"dan *f.is.*

**HAMARLANMAQ** *məch.* Hamar hala salınmaq, düz edilmək, düzləndirilmək. *Həyəti basmış yanıq iyi verən sirkan biçilmiş, yer hamarlanıb süpürülmüşdü.* İ.Hüseynov.

**HAMARLAŞMA** "Hamarlaşmaq"dan *f.is.*

**HAMARLAŞMAQ** *f.* Hamar olmaq, hamar hala düşmək, düzlənmək. *Mala çəkildikdən sonra sahə hamarlaşdı.*

**HAMARLATMA** "Hamarlatmaq"dan *f.is.*

**HAMARLATMAQ** "Hamarlamaq"dan *icb.*

**HAMARLAYICI** *sif.* Bir şeyin səthini hamarlamaq üçün işlədilən. *Hamarlayıcı maşın.*

**HAMARLIQ** *is.* Hamar şeyin halı, hamar, düz olma. *Kiçik kol-koslar, ensiz arxların kənarlarında bitmiş hündür qamışlar da çölün hamarlığına qovuşaraq geniş düzənlikdə əriyib batırdı.* Q.İlkin.

**HAMARLÜLƏLİ** *sif.* Lüləsində yiv olmayan, lüləsi hamar olan; yivsiz. *Hamarlüləli tüfəng.*

**HAMAŞ¹** *sif.* Topa, bir-birinə bitişik (çiçək və meyvə haqqında).

**HAMAŞ²** *is.* Yol yoldaşı. *Bu dünya bir yol kimidir, biz axirət müsafiri; Kəcavədə hamaş gərək öz hamaşilən yanaşa.* Şəhriyar.

**HAMBAL** *is.* [*ər.*] 1. Belində yük daşımaqla keçinən adam. [Gülpəri] *cəld nökər Cəfəri göndərib iki nəfər hambal çağırtdı, yanındakı və baqajdakı şeyləri daşıdıb ikinci klas salonuna yığdırdı.* S.S.Axundov.

2. *məc.* Döşəmənin altına və ya evin səqfinə qoyulan tir. // Evin səqfindəki şalbanı saxlamaq üçün onun altına qoyulan paya; dayaq. *..Səqfin ortalığından bir hambal verilib ki, tirlərə təkyə olub, onları möhkəm saxlasın.* C.Məmmədquluzadə.

**HAMBALLIQ** *is. köhn.* Hambalın işi, sənəti, peşəsi. *Sonra da bir zaman* [Nadir] *Bakıya gəlib, bazarda hamballıq etdi.* B.Talıblı.

**HAM-HAM** *təql.* 1. B a x **ham(m)**.

2. *uş.* İt.

**HAMI** *əvəz.* Bir nəfər də kənarda qalmayaraq, hamısı, bütün adamlar. *Hamı razıdır. Hamı ayağa qalxdı. Hamı iclasa gəlməlidir. Hamı işə tələsir. – Bu adam hamının bildiyi, tanıdığı Cəfər əmi idi.* H.Nəzərli. *Xaspoladın çağırışına hamı gəlmişdi.* M.Hüseyn.

**HAMILIQLA, HAMILIQCA** *zərf* Bir nəfər də kənarda qalmayaraq, hamısı bir yerdə; birlikdə, cəmən. [Fazil:] *Nə baxırsınız gözümün içinə? Nə səbəbə hamılıqla ayağa qalxıb təzim etmirsiniz?!* Ə.Haqverdiyev. // Yekdilliklə. *Hamılıqla namizədə səs vermək.*

**HAMISI** b a x **hamı**. Adamların hamısı gəlmişdi. – [Tələbə:] *Bizim yoldaşların hamısı bu gün məktəbdə olub.* Z.Xəlil. // Eyni mənada əşya haqqında. *Binaların hamısı təmir olunub.* – [Kərbəlayı Qubad:] *Görəsən, bu evlərin hamısı Mərcan bəyindir?* Ü.Hacıbəyov.

**HAMİ** *is.* [*ər.*] 1. Birini himayə edən, himayəsi altına alan, qoruyan; himayəçi, havadar, arxa. *Rüstəm bəyin üzündə hami axtaran bir çocuq ifadəsi vardı.* Çəmənzəminli. *Geydiyin arxalıqdır; Hamidən arxalıqdır; Hicran əydi aşiqi; Bu necə arxalıqdır?* (Bayatı). ☐ **Hami olmaq** – birisinə arxa durmaq, havadarlıq etmək, himayəçi olmaq. *..Qulam müəllim başsız qalmış Nənəqız ailəsinin hamisi olmaq, onun çocuqlarına yardım etmək istəyirdi.* S.Rəhimov.

2. Birisinə və ya bir təşkilata hamilik edən adam və ya təşkilat. *Bu işdə hamilər çox kömək edə bilərlər.*

**HAMİL** *sif.* [*ər.*] *köhn.* 1. Yüklü, yüklənmiş.

2. Üzərində olan.

3. Daşıyan, götürən.
4. *is.* Sahib, yiyə.

**HAMİLƏ** *sif.* və *is.* [*ər.*] Hamiləlik vəziyyətində olan; ikicanlı, boylu, boyudolu. *Hamilə qadıntək yuxusu möhkəm; Qucağı doludur dərələrin də.* M.Araz. *Kənddə işlər qarışan zaman gəlin birdən-birə hamilə olmuş və oğlan doğmuşdu.* İ.Şıxlı.

**HAMİLƏLİK** *is.* Qadın orqanizmində rüşeymin inkişaf dövründəki vəziyyəti; ikicanlılıq, boyluluq.

**HAMİLİK** *is.* 1. Himayəçilik, havadarlıq, himayə etmə, qanadı altına alma. *Qulam müəllim istəyirdi ki, Mehparə və Sitarə onun hamiliyi ilə oxuyub ali təhsil alsınlar.* S.Rəhimov.

2. Birisinə və ya bir təşkilata istehsalat, mədəni, siyasi və b. cəhətdən müntəzəm kömək göstərməkdən ibarət ictimai fəaliyyət; hər hansı bir işdə kömək göstərmə. *Hamınızdan tələb olunur ki, musiqidə hamilik və radio işlərində tezliklə dönüş yaradaq.* Ü.Hacıbəyov. ◻ **Hamiliyə almaq (götürmək)** – belə kömək göstərməyi öhdəsinə almaq (götürmək).

**HAMPA** *is.* [*fars.* həm və pa – ayaq] 1. Keçmişdə kənd varlısına, dövlətliyə verilən ad. [1-ci kəndli:] *Burada bir Hacı Bayram deyil, ondan savayı da neçə hampa var.* Ə.Haqverdiyev. *Qoyunçu hampalar bu gen hörüşü; İcarə eyləyib saldılar yataq..* H.K.Sanılı.

2. *məc.* Yoldaş, sirdaş. [Qoca:] *Sən* [Beyrək] *qız istəmirsən, özünə bir hampa istəyirsən...* M.Rzaquluzadə.

**HANA**[1] *is.* Əllə xalça, palaz və s. toxumaq üçün yerdə qurulan dəzgah; xana. *Axşamdan yıxılır, ertədən yatır; Həftədə hanaya bir arğac atır..* Aşıq Ələsgər. *Qızlar oturmuşlar qabaqda hana; Xalı toxuyurlar damaqları çağ.* Z.Xəlil. ◻ **Hana toxumaq** – hanada xalça, palaz və s. toxumaq. *..Saray qulamlarından biri Kazımın həyatinə girib artırmada hana toxuyan Telli ilə Gülnaza yanaşdı.* Çəmənzəminli.

**HANA**[2] *is.* b a x **xına**. *İki qoyun yan-yana; Əlimə yaxdım hana; Sənə süd verən ana; Olsun mənə qaynana.* (Bayatı).

**HANDA** "Harada" sual əvəzliyinin danışıq dilində işlənən forması. [Qurbani:] *İbtida eyləyib girdim meydana; Aşıqlar ustadı, görün, handadı?* "Qurbani". *Gül əkdim gül məkanda; Yerin bil, gül, məkanda; Sən güldün, mən də güldüm; Mən handa, gülmək handa?!* (Bayatı).

**HANI** "Harada?" "haradadır?" mənasında sual əvəzliyi. [Giziroğlu:] *Hanı bu bağçanın gülü; Oxumur şeyda bülbülü.* "Koroğlu". *Hanı rəngli çiçəklərin, a çəmən? Bir gözəl dəstə gül tutaydım mən.* A.Şaiq.

**HANKI, HANSI** *əvəz.* 1. İki və ya bir çox şeydən birini müəyyənləşdirəcək cavab almaq üçün sual kimi işlənir. *Hansı əsərdən xoşunuz gəlir? Sitatları hansı məxəzlərdən götürmüsünüz? Hansı mərtəbədə yaşayırsınız? – Hansı qüvvələrin şəhərə hakim olması bəlli deyil idi.* Çəmənzəminli. [Şah:] *Vəzir, mənimçin hansı peşəni məsləhət görürsən?* Ü.Hacıbəyov.

2. Ayırıcı, müəyyənləşdirici sual kimi işlənir. *Hansı böyükdür, hansı kiçik? Bunlardan hansı müdirdir, hansı müavin?* – [Məşədi İbad:] *Bir deyin görüm, xanım hansınızdır, qulluqçu hansınız?* Ü.Hacıbəyov.

3. Bir şəxsin, ya şeyin keyfiyyəti, xüsusiyyəti, xassəsi haqqında sual bildirir. *Hansı məziyyətinə görə onu bu qədər xoşlayırlar? – Söylə, şirinlikdə, hansı fidanda; Hansı gülüstanda, hansı cahanda; Ey yoldaş, ey qadın, sənin varın var?* M.Müşfiq.

4. Bir şeyin əmələgəlmə vaxtı, ardıcıllığı haqqında sual kimi işlənir. *Hadisə hansı ayda baş vermişdir? Siz hansı ildə anadan olmuşsunuz? – Bunu istiyirik bilək ki, aya bu papaqlar* [müsəlman papaqları] *hansı əsrdən və nə vaxt bu tövr bizim içimizdə adət olubdur?* C.Məmmədquluzadə.

5. "Hər bir", "hər hansı", "hər hansı bir" mənasında işlənir. *Hansı adamı dindirsəniz, eyni cavabı eşidəcəksiniz. Hansı kitabı açsanız, tapa bilərsiniz. – Hankı səmtə, hankı yana; Hey uçsam da, yuvam sənsən.* S.Vurğun. [Cahan Əsgərə:] *Hansı bəyin və ya tacirin qızını istəsən, gedim, sənə alım.* Ü.Hacıbəyov. // Eyni mənada əsasən inkar cümlələrində işlədilir. *Hansı şagird usta olmağa çalışmır?*

6. Qeyri-müəyyənlik bildirir. *Bilmirəm, hansı ağzıgöyçək deyib ki, "insan əşrəfi-məxluqatdır"?* M.Hüseyn.

◊ **Hansı ki** – təyin budaq cümləsini baş cümləyə bağlayan və baş cümlədə olan ismi budaq cümlədə əvəz edən bağlayıcı. *Niyə cavab vermədin; o demaqoq hərifə? Hansı ki, srağagün; məni tənqid elədi?* R.Rza.

**HANTÉL** [*alm.*] *idm.* Qısa dəstəklə bir-birilə birləşmiş iki çuqun şardan ibarət gimnastika aləti (əzələləri inkişaf etdirmək üçün işlənir).

**HAP-GOP** *is.* Gurultulu, lovğa, lakin boş, əhəmiyyətsiz sözlər, hay-küy. *Hap-gopuna baxma, əlindən heç şey gəlməz. – Mən bacarsaydım əgər, yaxşı cilovlardım onu; Baxmayın hap-gopuna, ömrü bitibdir, sonudur.* S.Rüstəm. [Qızyetər:] *Elə hap-gopu var, – dedi, – mən olmasam, ala qarğalar başında yuva tikər.* M.İbrahimov.

**HAP-GOPÇU** b a x **gopçu**. *Hap-gopçunun biridir.*

**HARA** *sual əvəz.* 1. Hansı yer, hansı məkan, yaxud hansı istiqamət, hansı tərəf. *Kitabları hara qoydu? Stulu hara apardın?* – [Sevil Gülüşə:] *Balaşdan soruşmamış hara gedə bilərəm?* C.Cabbarlı. [Gülsənəm:] *Ağa, bu qabları hara düzəcəyik?* H.Nəzərli.

2. Bədənin və ya bir şeyin hər hansı bir yeri. *Onun harası pisdir? Harasına gözəl deyirsən!* – [Məşədi İbad:] *A kişi, bircə mən bilmədim ki, camaat mənim harama qoca deyir!* Ü.Hacıbəyov. [Şahmar Şahpəriyə:] *Mənim yaram ağrıyır, sənin haran ağrıyır.* B.Bayramov.

3. **Haradasa** şəklində – naməlum yerdə, qeyri-müəyyən yerdə. *Haradasa uşaq ağlayırdı. – Qaraşın səsi çox zəiflədi, haradasa kəsilib qırıldı.* M.İbrahimov. *Haradasa böcəklər hərdənbir cırıldaşırdı.* Q.İlkin.

◊ **...hara, ...hara** – iki və ya çox şeyin keyfiyyətinin, vəziyyətinin müqayisəsində işlədilir. *Həftəbaşı Xınalığa gələn avtodükan yeni-yeni mallar gətirir. İndiki Xınalıq hara, keçmişki hara.* R.Rza. *Vətən günü-gündən dönür gülzara*; *Gor dünənim hara, bu günüm hara.* B.Vahabzadə. **Sən hara, bura hara** – bir adamı gözlənilməyən bir yerdə gördükdə təəccüb məqamında işlədilir. *Sən hara, bura hara, yəqin sən də ziyarətə gəlmisən?* E.Sultanov. [Sultan bəy: ] *Paho, Süleyman, sən hara, bura hara?* Ü.Hacıbəyov.

**HARADA** *sual əvəz.* Hansı yerdə? hayanda? *Səni harada görə bilərəm? Dəftərlər haradadır?* – [Məşədi Qəzənfər:] *Əşi, adam gərək insaf ilə danışsın, qışın soyuğunda harada qızışa bilərsən?* [Xor:] *Hamamda!* Ü.Hacıbəyov. *Həmin gecə saat doqquzdan on ikiyədək Ləman harada idi?* H.Seyidbəyli. // **Haradasa** şəklində – hansı yerdəsə, hayandasa, naməlum yerdə. *Haradasa musiqi çalınırdı.*

**HARADAN** *sual əvəz.* Hansı yerdən? hayandan? hansı tərəfdən? *Haradan gəlirsən? Haradan almısan? Haradan gəlmisənsə, oraya da getməlisən. Onun əsli haradandır?* – [Murad] *Nigar kimi gənc, gözəl, çocuqlarına mehriban bir qadını haradan tapacaqdı?* S.Hüseyn. *Bu çayların haradan axıb gəldiyinə dair hərə bir fikir söyləyir.* M.Hüseyn. // **Haradansa** şəklində – hansı yerdənsə, hayandansa (naməlum, bəzən gözlənilməz bir şey haqqında). *Haradansa uzaqdan güllə səsi eşidildi. – ..Haradansa əsib gələn .. bir sazaq insanın iliyinə işləyirdi.* M.İbrahimov. *Fəhlələr haradansa xörək tapıb gətirmişdilər.* M.Hüseyn.

**HARALI** *əvəz.* Birisinin hansı yerdən, harada anadan olduğunu, vətəninin hara olduğunu bilmək üçün işlədilir. *O haralıdır?* – [Mansur xan:] *Söylə görüm, haralısan, ay gözəl?* C.Cabbarlı. *Yolçu sevinərək qocanı saxladı, ondan haralı olduğunu soruşdu.* Ə.Məmmədxanlı.

**HARAM** *sif.* [*ər.*] 1. İslam dininin ehkamlarına görə yeyilməsinə, işlədilməsinə icazə verilməyən (*halal* əksi). *Haram mal bərəkət tutmaz.* (Ata. sözü). [Yaşlı kişi:] *Mən tamamilə mövhumatçı bir gəncdim, din və şəriətin haram bildiyi heç bir iş arxasınca getməmişdim.* S.Hüseyn.

2. *məc.* Zəhmətlə, əməklə, düz yolla qazanılmayan, əldə edilməyən. [Musa:] *Çalış, sən həmişə öz əməyin ye; Haram mal yeməyə alışma, dilim.* "Abbas və Gülgəz". *Kimsə öz adına vurmurdu ləkə; Acından ölsə də haram yemirdi.* Ə.Kürçaylı.

◊ **Haram eləmək (etmək)** – b a x **haram qatmaq** 2-ci mənada. [II qul:] *Yenə səhər tezdən Bəhram; Yuxumuzu etdi haram.* A.Şaiq. *Bu söz çox vaxt* [Ağasəfər və Həmzənin] *yediyini haram etmişdi.* Ə.Əbülhəsən. **Haram iliyi** – b a x **onurğa beyni** (“**onurğa**”da). *Balığın sinir sistemi beyin və haram ilikdən və buradan da bədənin hər tərəfinə yayılan incə sinirlərdən ibarətdir.* C.Cəbrayılbəyli. **Haram qatmaq, harama qatmaq** – 1) təmiz, düz yolla əldə edilmiş bir şeyi korlamaq, təmizlikdən məhrum etmək. [Xortdan:] *Hamı yəqin edir ki, belə adam müştəri aldadıb malına haram qatmaz.* Ə.Haqverdiyev. [Yaşlı kişi tacirə:] *Sən mənim xeyir-bərəkətimi qaçıracaqsan, sən mənim halal malıma haram qatacaqsan!.. – deyərək uzun-uzadı deyinərdi.* S.Hüseyn; 2) pozmaq, mane olmaq. *Haram qatıb onlar şirin yuxuya; Yetişdilər səhər tezdən Nuxaya.* H.K.Sanılı. *Atlar yorulmuşdu. Faytonçunun cidd-cəhdinə baxmayaraq, yerişlərinə haram qatmaq istəmirdilər.* İ.Şıxlı. **Haram olsun!** – qarğış məqamında işlədilir. *Ananın südü sənə haram olsun.* – [Teymur ağa:] *Mənim atamın yaxşılıqları* [vəzirə] *haram olsun!* M.F.Axundzadə. **Haram tikə** – düzgün olmayan yollarla əldə edilmiş hər hansı bir şey. *Azdı ac gödənə yüz haram tikə..* M.Araz.

**HARAMXOR** *sif.* və *is.* [*ər.* həram və *fars.* xor – yeyən] Özgənin malına, şeyinə, puluna tamah salan; müftəxor. [Mustafa bəy:] *Hamınız haramxorsunuz, hamınız oğrusunuz!* Ə.Haqverdiyev.

**HARAMZADƏ** *is.* [*ər.* həram və *fars.* zadə] Fırıldaqçı, kələkbaz, hiyləbaz, bic, yaramaz, tülüngü. [Murov:] *Haramzadələr, mənim əlimdən hara gedəcəksiniz.* M.F.Axundzadə. [Vahimə Çiçəyə:] *Mən günahkar deyiləm ki, haramzadə oğlun bütün zati-pakını danır?* B.Bayramov.

**HARAMZADƏLİK** *is.* Fırıldaqçılıq, kələkbazlıq, hiyləbazlıq, biclik. *..Dəstədə bir müsəlman görmürəm ki, ondan bir haramzadəlik və xəyanət baş verməmiş ola.* C.Məmmədquluzadə.

**HARAY** 1. *nida.* Dad, aman, vay, dad-fəryad, dad-fəğan. *Haray, kim nə dilim var, nə dil anlayanım.* Qövsi. *Haray, ey şerimin tunc qanadları; Fikrimin, hissimin ceyran atları.* M.Müşfiq.

2. *is.* Qışqırıq, hay-küy, cığır-bağır, bağırtı səsi; qışqırıq-bağırıq. *Məscidi doldurur haray, qışqırıq; Qarğış, hədələmə, söyüş, fişqırıq.* S.Vurğun. *Kənddə qulaqbatıran bir haray vardı.* M.Hüseyn. □ **Haray çəkmək (qoparmaq)** – b a x **haray salmaq** 2-ci mənada. *Qatar yaxınlaşır haray çəkərək; Gözətçi özünü itirir bu an.* B.Vahabzadə. *Balta durmadan yarır; Motor haray qoparır.* İ.Səfərli. **Haray etmək** – b a x **haray salmaq** 1-ci mənada. *Bir çoban bir gün etdi dağda haray; Canavar var, – dedi, – gəlin, ey vay.* M.Ə.Sabir. **Haray salmaq** – 1) qışqırmaq, bağırmaq, çığırmaq, haray etmək. *Kəndə bir az qalmış qoca qabağa gedib səsi dolusu haray saldı.* S.Rəhimov; 2) səs-küy salmaq, gurultu qoparmaq, gurultu salmaq (qoparmaq). *Haray salıb dağa-daşa; Köpüklü çay daşa-daşa; Axar uca qayalardan.* B.Vahabzadə.

3. *is.* Kömək, imdad. [İskəndər xan:] *..Atamdan mənə bir haray olmayacaq, qalmışam naçar.* N.Vəzirov. [Fazil:] *Vallah, mən özüm də məəttəl qalmışam, çünki o dəli övrətdən də, deyəsən, bir haray yoxdur.* C.Məmmədquluzadə. □ **Haraya gəlmək (yetmək, yetişmək, çatmaq)** – köməyə gəlmək, imdada yetmək. [Ağa:] *Haraya gəlincə itlər məni bu gördüyünüz halətə saldılar.* Ə.Haqverdiyev. *Qız müəllimin harayına çatmaq istədi.* S.Rüstəm. *Ona yetmək üçün haraya dostlar; Aldı təyyarəni araya dostlar.* M.Rahim.

**HARAYA** *sual əvəz.* Hansı yerə? hansı tərəfə? hayana? *Haraya gedirsən? Haraya baxırsan? – Haraya belə, Ələmdar? – deyə Bənövşə çəkinə-çəkinə soruşdu.* S.Rəhimov.

**HARAYÇI** *is.* Haraya gələn, köməyə gələn, özünü haraya çatdıran, yaxud dalaşanları gəlib ayıran adam. [Cabbar bəy:] *Zalım oğlu istəyirmiş barmağını salıb biçarə arvadın gözünü töksün, harayçı qoymayıb...* N.Vəzirov. *Bir azdan sonra harayçı töküllüb, kərbəlayını baş-gözünün qanı axa-axa götürüb getdilər.* Çəmənzəminli.

**HARAY-HƏŞİR** *is.* Hay-küy, səs-küy. *Bir tərəfdə haray-həşirlə daş, qum daşınır, o*

*biri tərəfdə qumla əhəng qarışdırılıb palçıq edilirdi.* S.Rəhimov. ◻ **Haray-həşir salmaq** – qışqırmaq, dad-fəryad qoparmaq, hay-küy salmaq, qiyamət qoparmaq, mərəkə qoparmaq. *Kimsə dedi: – Bir ovuc tut qurusundan ötrü haray-həşir salma, kişi!* Ə.Abasov.

**HARAYLAMA** "Haraylamaq"dan *f.is.*

**HARAYLAMAQ** *f.* 1. Qışqıraraq çağırmaq, səsləyib çağırmaq. *Ana vətən harayladı; Dar günündə övladını.* N.Rəfibəyli.

2. *məc.* Hava ilə oxumaq. *Bir az keçmədi ki, Cümşüd bəy damağını sazlayıb çıxdı dama, başladı haraylamağa.* E.Sultanov. *Xanəndə qavalı üzünə tutub, "əziziyəm" deyə harayladı.* Mir Cəlal.

**HARAYLAŞMA** "Haraylaşmaq"dan *f.is.*

**HARAYLAŞMAQ** *qarş.* Bir-birini bərkdən çağırmaq, qışqıraraq səsləmək. *Çobanlar haraylaşırdılar. Uşaqlar qaçışır və haraylaşırlar.*

**HARIN** *sif.* 1. Yaxşı bəslənməkdən, yaxşı baxılmaqdan kökəlmiş, qızğınlaşmış, azğınlaşmış; tünd. *Harın dayça.* – [Xanlar:] *Nə qədər xam və harın at olsa,* [anam] *cilovunu dəstələyib belinə atılasıdır.* Qantəmir. *Xanın doqquz ay qaranlıq tövlədə bəslənmiş harın buğasını meydana çıxardılar.* M.Rzaquluzadə.

2. *məc.* Qudurğan, azğın, həddindən artıq lovğa, özündənrazı, mütəkəbbir adam haqqında. *Harın qız. – Rüxsara xanım Kərbəlayı Səftərin tox və harın sifətini görüb, bir söz deməmdi, ətrafına göz gəzdirdi.* T.Ş.Simurq. *Bu almazlar işğalçıların zəngin salonlarında bərq vurur, harın xanımların qolunu, boynunu bəzəyir.* R.Rza.

**HARINLAMA** "Harınlamaq"dan *f.is.*

**HARINLAMAQ** *f.* 1. Yaxşı bəslənməkdən, yaxşı qulluq edilməkdən kökəlmək, qızışmaq, harınlaşmaq. *At bütün qışı tövlədə xama bağlanıb, yeyib harınlamışdı.* "M.N.lətif."

2. *məc.* Qudurmaq, azğınlaşmaq, vəhşiləşmək, harınlaşmaq. *Dəniz kimi kükrədilər, dalğa kimi döş gərdilər; Harınlamış* (f.sif.) *polislərə onlar yumruq göstərdilər.* B.Vahabzadə.

**HARINLAŞMA** "Harınlaşmaq"dan *f.is.*

**HARINLAŞMAQ** b a x **harınlamaq**.

**HARINLIQ** *is.* 1. Harın, harınlaşmış heyvanın halı.

2. *məc.* Qudurğanlıq, azğınlıq, zorba-zorluq. *Vəzirov göstərir ki, bəylərin tüfeyli, müftəxor təbiəti özbaşınalıq, harınlıq, əxlaqsızlıq doğurur.* C.Cəfərov.

**HARMATAN** *is.* Afrikada quru və qızmar külək.

**HARMÓNİYA** [*yun.*] 1. *mus.* Musiqi nəzəriyyəsinin, akkordların düzülüşünü, musiqinin ümumi inkişafında onların qarşılıqlı əlaqəsini şərh edən bölməsi. // Bir neçə həmahəng tonların bir vaxtda səslənməsi. *Əllini keçsə də yaşım; Nə polifoniya, nə harmoniyadan çıxır başım.* R.Rza.

2. B a x **ahəng** 1-ci mənada.

**HASAR** *is.* [*ər.*] 1. Daşdan, kərpicdən və s.-dən tikilən hasar; barı, sədd. *Bağın hasarı. Hasardan aşmaq. – Böyük bir qala var, dörd yanı hasar; Daşında paslanmış əski yazılar.* S.Vurğun. *Arxa tərəfdən taxta hasarın kiçik qapısı vardı.* Q.İlkin. ◻ **Hasar çəkmək** – divar tikmək, barı çəkmək, hasarlamaq. *Bağın ətrafına hasar çəkmək. // məc.* Bir şeyin birləşməsinə, yaxınlaşmasına mane olan şey; maneə, sədd. ◻ **Hasar çəkmək** – mane olmaq, maneə yaratmaq. *Sorağını alsam elə bu gün sənin uzaqlardan; Məhəbbətə hasar çəkməz nə ayrılıq, nə də zaman.* S.Vurğun.

2. Hasarı, çəpəri xatırladan adam, ya şeylər sırası. *Yolun o tay-bu tayında hasar təşkil edən dilənçilər, kor və əlillər... sədəqə diləyirdilər.* Çəmənzəminli. *Heyət üzvləri dəmir və polad silahlardan düzəlmiş hasarın içərisi ilə keçib Atabəy bağına gedirdi(lər).* M.S.Ordubadi.

**HASARLAMA** "Hasarlamaq"dan *f.is.*

**HASARLAMAQ** *f.* Hasar çəkmək, barı çəkmək, barılamaq. *Həyəti hasarlamaq.*

**HASARLANMA** "Hasarlanmaq"dan *f.is.*

**HASARLANMAQ** *məch.* Hasar çəkilmək, barı çəkilmək, barılanmaq. *Məktəbin ətrafı hasarlanmışdı.* – [Kiçikbəyim] *məhbəs kimi qalın divarlarla hasarlanmış* (f.sif.) *Tehran sarayını gözlərinin qabağına gətirirdi.* Çəmənzəminli.

**HASARLATMA** "Hasarlatmaq"dan *f.is.*

**HASARLATMAQ** *icb.* Hasar çəkdirmək, barı çəkdirmək.

**HASARLI** *sif.* Hasarı, barısı, divarı olan; barılı, divarlı. *Rübabə Sadıq kişinin alçaq,*

*daş hasarlı həyatinə girəndə ürəyi döyündü.* Mir Cəlal.

**HASİL** [*ər.*] 1. *sif. kit.* Hüsula gələn, vücuda gələn, ortaya çıxan, törəyən. ◻ **Hasil etmək** – 1) almaq, əldə etmək. *İzin hasil edəndən sonra Əhməd içəri daxil olub, .. əl-əl üstə qoyub, salam məqamında durdu.* (Nağıl). [Tağı Xudayar bəyə:] *Mən indi müsinn adamam, özümə görə də təcrübə hasil eləmişəm.* C.Məmmədquluzadə; 2) istehsal etmək. *Bu günlər inşaatçılar əsas qüvvələrini enerji hasil edəcək turbinin quraşdırılmasına yönəltmişlər.* (Qəzetlərdən). **Hasil olmaq** – 1) nəticə kimi ortaya çıxmaq, ələ gəlmək. *Neçə gün ciddi axtarış getdisə də, bir səmərə hasil olmadı.* Ə.Haqverdiyev. [Yaqub:] *Əvvəl burada Möhsün bəy çalışırdı. İki il işlədi, bir nəticə hasil olmadı.* B.Talıblı; 2) törəmək, vücuda gəlmək, özünü göstərmək. *Qılıncdan murad hasil olmadı, əmuda əl atdılar.* "Koroğlu". *Ana dedim, ürəyimə yanar odlar saçıldı; Ana dedim, bir ürpəriş hasil oldu canımda.* M.Müşfiq; 3) yerinə yetmək, həyata keçmək. *Hasil oldu Qurbaninin diləyi; Tanımaram nə sultanı, nə bəyi.* "Qurbani". [Fitnə:] *Oxu, bülbülüm oxu, hasil olsun diləklər.* A.Şaiq; 4) yetişmək, bitmək. *Hər meyvə olur hasil; Zəhmətlə, köməklərlə.* A.Şaiq. *Alınıb-satılan yalnız kənddə hasil olan şeylər və heyvanat qismi idi.* Ə.Abasov. **Hasilə çatmaq** – boya-başa çatmaq. *Layla deyim yatınca; Gözlərəm ay batınca; Canım cəzanə gəldi; Sən hasilə çatınca.* (Layla). **Hasilə gəlmək** – 1) bitmək, yetişmək, əmələ gəlmək. *Pambıq isə torpaqda bitir, bizim yerlərdə hasilə gəlir.* Ə.Vəliyev; 2) hazırlanmaq, hazır olmaq. *Plov hasilə gələndən sonra Müşgünaz süfrəni hazırladı.* Ə.Vəliyev; 3) yetişdirilmək, hazırlanmaq. [İrəvan darülmüəlliminindən] *ancaq otuz, artıq başı qırx nəfərə kimi müəllimlər hasilə gəlibdir.* F.Köçərli. **Hasili-kəlam** *köhn.* – sözün qısası, xülasə, müxtəsər. [Xarrat:] *Hasili-kəlam, bəşər uşaqları heç də nəzər-diqqətə alınmır.* T.Ş.Simurq. **Qənaət hasil etmək** – bax **qənaətə gəlmək** (**"qənaət"**də). *Zəki Məmmədbağırın xəriflədiyinə qənaət hasil etdi.* S.Hüseyn. **Nə hasil?** *klas.* – nə xeyri? nə olsun? nəticəsi yoxdur. *Doğru yola getmədim, nə hasil? Bir mənzilə yetmədim, nə hasil?* Füzuli. *Yüz il başın yerə döysə, nə hasil; Zahidin bihudə ibadətindən.* Q.Zakir. // Nəticə kimi ortaya çıxan şey; nəticə, səmərə. *Səng şikəst eylədi balü-pərim; Banlamağın hasilini anladım.* M.Ə.Sabir.

2. *köhn.* bax **məhsul** 1-ci mənada. *Cəm edəcək tarlasının hasilin; Bəsləyəcək ailəsin, həm elin.* M.Ə.Sabir. *Bir pud buğda əkib əvəzində iki yüz pud hasil alırlarmış.* S.Hüseyn.

3. *is. riyaz.* Vurma əməlində alınan rəqəm. *2 ilə 3-ün hasili 6-dır.*

**HASİLAT** *is.* [*ər.* "hasil" söz. cəmi] İstehsal olunan, hasil edilən məhsulların hamısı bir yerdə; məhsulat. *Süd hasilatı. İllik hasilat. Kömür hasilatı. – Guya onların qayda və üsulu ilə burada əkinçilik aparılsa, hasilat birə-beş, birə-on artarmış..* S.Hüseyn.

**HAŞA** [*ər.*] 1. *nida.* Olmasın, Allah eləməsin, Allah göstərməsin, ...uzaq. [Qəmər deyirdi:] *Haşa... Min il zindanda çürüsəm də evləndi yoxdur.* (Nağıl) [Mirzə Camal:] *Axund, yoldan sonra bu qarlı havada hamama buyurulsa, haşa sizdən, sətəlcəm peyda olar.* Çəmənzəminli.

2. *zərf* Əsla, qətiyyən, heç vaxt. *Bahariömrünü versə də başa; Aşıq məşuqədən usanmaz haşa!* M.P.Vaqif. *Dolandım dünyanı, gəzdim baş-başa; Sənin kimi gözəl görmədim haşa.* Aşıq Ələsgər.

**HAŞALAMA** "Haşalamaq"dan *f.is.*

**HAŞALAMAQ** *f. dan.* Danmaq, inkar etmək, boynundan atmaq.

**HAŞİYƏ** *is.* [*ər.*] 1. Parçanın və s.-nin kənarında rəngi, gülü, materialı cəhətdən ondan fərqlənən zolaq. *Döşəmənin haşiyəsi. – Çarşabın kənarında yaşıl ipəklə tikilmiş haşiyələr var idi.* M.S.Ordubadi. *Xalçanın naxışlı yol-yol haşiyələri gözlərdə parıldayırdı.* Mir Cəlal. // Parçanın, divar kağızının və s. kənarlarını çevrələyən zolaq. // Çərçivə.

2. Kitab və s.-nin səhifələrinin kənarında ağ yer. *Kitabın haşiyəsi.* // Həmin ağ yerdə yazılmış yazı, qeyd.

3. *məc.* Əsas məsələ ilə əlaqəsi olmayan və ya az əlaqəsi olan danışıq, ya yazı. *Hə, hə – deyə, Naznaz Yarməmmədin haşiyəsinə qulaq asmayıb tələsdirdi.* M.İbrahimov. ◻ **Haşiyə çıxmaq** – mətləbdən kənara

çıxmaq, əsas məsələni qoyub başqa şeylərdən danışmaq, ya yazmaq. *Buradan bir haşiyə çıxıb keçən günlərə qayıdıram.* C.Məmmədquluzadə. *O, bir şəlalədir axır ürəkdən; Burda bir haşiyə çıxmalıyam mən.* S.Vurğun.

**HAŞİYƏLƏMƏ** "Haşiyələmək"dən *f.is.*

**HAŞİYƏLƏMƏK** *f.* Kənarlarına haşiyə tikmək, haşiyə ilə çevrələmək, haşiyə çəkmək. *Paltarın ətəyini haşiyələmək.* // *məc.* Dövrələmək, çevrələmək, əhatə etmək. *Respublika ərazisinin yarısından çoxunu təşkil edən dağlıq sahələr onu şimaldan, qərbdən, cənubdan və cənub-şərqdən haşiyələmişdir.* "Azərbaycana səyahət".

**HAŞİYƏLƏNMƏ** "Haşiyələnmək"dən *f.is.*

**HAŞİYƏLƏNMƏK** *məch.* Kənarlarına haşiyə tikilmək, haşiyə çəkilmək, çərçivəyə alınmaq, çərçivəyə salınmaq. *Burada Azərbaycan kənd təsərrüfatı qabaqcıllarının gözəl işlənib haşiyələnmiş* (f.sif.) *portretlərinə də baxdıq.* (Qəzetlərdən). // *məc.* Dövrələnmək, çevrələnmək. [Nuriyyə:] [Leytenantın] *ay işığında qara kölgə ilə haşiyələnmiş* (f.sif.) *gözlərinə baxaraq, əlimi iri, cod və gözəl əlindən çəkmədən susurdum.* İ.Əfəndiyev.

**HAŞİYƏLİ** *sif.* Haşiyəsi olan, kənarları haşiyələnmiş. *Haşiyəli süfrə. Haşiyəli döşəmə. – Yunis .. göy haşiyəli dəsmalı ilə alnının tərini sildi.* Mir Cəlal. *Hənifə balağı haşiyəli tumanı ilə torpaq döşəməni süpürə-süpürə eşiyə yüyürdü.* İ.Hüseynov.

**HATƏM** *is.* [Şərq əsatirində çox varlı, əfsanəvi bir adamın adından] Əliaçıq, səxavətli, comərd adam haqqında. [Səlim bəy:] *Xub, səbəb nədir ki, Mirzəyə gələndə Hatəm olursan, bizə gələndə cibinin ağzını buzov çatısı ilə bağlayırsan?* Ə.Haqverdiyev. [Faytonçu:] *Bəli, bəs kişilərdə belə bir Hatəm səxavəti gördüm.* S.Rəhimov.

**HAUPTVÁXT** [*alm.*] Əsgəri vəzifədə olan şəxsləri həbsdə saxlamaq üçün xüsusi bina.

**HAVA**$^1$ *is.* [*ər.*] 1. Yer atmosferini əmələ gətirən qazların, başlıca olaraq azotla oksigenin qarışığı. *Havanın təzyiqi. Şara hava doldurmaq. Təmiz havada nəfəs almaq. Rütubətli hava.*

2. Yeri əhatə edən boşluq, ənginlik; fəza. *Quşlar havada uçur. Təyyarə havaya qalxdı. Hava yolları. – Qatar-qatar olub qalxıb havaya; Nə çıxıbsız asimana, durnalar!* M.V.Vidadi. *Maşın getdikcə külək onun yavaş-yavaş dən düşən yumşaq qara saçlarını havada oynadırdı.* İ.Əfəndiyev.

3. Hər hansı bir yerdə müəyyən vaxtda atmosferin vəziyyəti (buludluluq, rütubət, yığıntı, hərarət və s.). *Yağmurlu hava. Havanın dəyişməsi. Havada rütubət hiss olunur. Payız havası. – Artıq günorta yaxınlaşmış, hava istiləşmiş, quşlar da yemlənib qalına çəkilmişdilər.* M.Rzaquluzadə.

4. Bir yerin sağlamlıq baxımından vəziyyəti, keyfiyyəti. *Sağlam hava. Ağır hava. Oranın havası mənə düşmədi. Dağ havası. – Bir sərin, saf səhər, gözəlcə hava; Bürünüb yamyaşıl çəmən, səhra!* A.Şaiq. *Biz hələlik üz-üzə gəlirik küləklərlə; Hələlik çox ağırdır Qaraqumun havası.* S.Rüstəm.

◊ **Hava almaq** – evdən kənarda, açıq havada nəfəs almaq, gəzmək, dincəlmək. [Şeyda:] *Azacıq hava almaq üçün dışarı çıxmışdım.* H.Cavid. [Fizzə xanım Vahidova:] *Dedim, bir az hava alarsan. Bütün günü stola yapışıb qalmısan.* Ə.Məmmədxanlı. **Hava həyəcanı** – havadan təhlükə olduğunu, düşmənin gəldiyini bildirən siqnal, təhlükə siqnalı. **Hava işıqlanmaq** – səhər açılmaq, dan yeri sökülmək. *Hava işıqlanana oxşamırdı.* Mir Cəlal. **Hava qaralmaq (qaranlıqlaşmaq)** – axşam olmaq, axşam düşmək, günəş batmağa başlamaq. *Həlim Qüdrətov Sağsağanlıya girəndə hava qaralmışdı.* Ə.Vəliyev. **Hava sınmaq** – soyuqlardan sonra hava yumşalmağa, istiləşməyə başlamaq. **Hava şarı** – 1) yuvarlaq (sferik) aerostat; 2) içi havadan yüngül qazla doldurulmuş, şarşəkilli uşaq oyuncağı. **Hava vannası** – bədəni möhkəmləndirmək və ya müalicə məqsədilə açıq havada günəş altında uzanma, özünü günəşə vermə. **Havada (havadan asılı) qalmaq** – bir məsələnin, işin aydınlaşdırılmaması, həll olunmaması haqqında. [Qoşatxan Kərəmə:] *Nə deyirik, hamısı qalır havada.* M.İbrahimov. **Başına hava gəlmək** – b a x **baş**.

**HAVA**$^2$ *is. mus.* Səslərin, müəyyən musiqi vəhdəti əmələ gətirən ardıcıllığı; musiqi ahəngi, melodiya. *Oyun havası. El havaları. – Çalardı düdükdə yanıqlı hava.* H.K.Sanılı.

*Mahnının Azərbaycan havaları kimi həzin, ruhoxşayıcı olması .. Aslanı valeh etdi.* S.Vəliyev.

**HAVADAR[1]** *is.* [*ər.* həva və *fars.* ...dar] Birinin tərəfini saxlayan, ona tərəf çıxan, onu müdafiə edən; tərəfgir, tərəfkeş, tərəfdar. [Göyüş dayı:] *Gəl oğul, gəl Məmməd, havadarım, gəl! Namusum, qeyrətim, etibarım gəl!* Z.Xəlil. *Müşavirədə bircə adam da Muxtara havadar olmamışdı.* B.Bayramov. // Eyni mənada bəzən mənfilik çaları ilə. *Xanlar zahirdə kirimiş durmaqla Cəmilin başını yastığa qoyurdu. Xəlvətdə öz havadarlarına deyirdi.* Mir Cəlal. [Yusif:] *Hümmətin də havadarı Alməmmədov olubdur, yoldaş katib!* B.Bayramov. ☐ **Havadar çıxmaq** – tərəfdar çıxmaq, tərəfini saxlamaq, razı olmaq. *Güllü arvad da indi qayıdıb tək evdə otura bilməyəcəyini hiss edərək, Maralın fikrinə havadar çıxdı..* Ə.Əbülhəsən.

**HAVADAR[2]** *sif.* [*ər.* həva və *fars.* ...dar] *köhn.* Yaxşı havası olan, havası tez-tez təzələnən, həmişə təmiz olan; sağlam. [Xarrat:] *Qayət havadar və ziyadar məskənlər vücuda gətirilmişdir.* T.Ş.Simurq.

**HAVADARLIQ** *is.* Tərəfdarlıq, tərəfgirlik, tərəfkeşlik.

**HAVADƏYİŞƏN** *is.* Otağın və s.-nin havasını dəyişib təmizləmək üçün cihaz, qurğu; ventilyator. // Sif. mənasında. *Yaşayış binalarındakı qızdırıcı və havadəyişən qurğulara yaxşı qulluq edilməlidir.* "Sağlam məişət uğrunda".

**HAVAXT** *əvəz.* Haçan, nə vaxt, nə zaman. *Əhvalat havaxt olmuşdu? Havaxt bizə gələcəksən? Havaxt gedəcəyi məlum deyil.* – [Nəbi:] *Havaxt lazım olsa sizə köməyim; Bir işarə verin, yetim haraya.* S.Rüstəm.

**HAVAXTADƏK, HAVAXTACAN** *əvəz.* Hansı vaxta, müddətə, ana qədər; haçanadək, haçanacan. *Havaxtadək* (*havaxtacan*) *gözləyim? – Havaxtadək olacağıq ikiqat?!* Q.Zakir.

**HAVAXTDAN** *əvəz.* Hansı vaxtdan, hansı müddətdən, haçandan. *Havaxtdan şəhərdə yaşayırsan?* – [Şahpəri:] *Xala nədir, adə, mən havaxtdan xala olmuşam?* B.Bayramov.

**HAVAQIZDIRAN, HAVAQIZDIRICI** *is.* Havanı qızdırmaq üçün cihaz, qurğu. *Yeni markalı havaqızdıran.* // Sif. mənasında. *Havaqızdıran cihaz.*

**HAVALANDIRMA** "Havalandırmaq"dan *f.is.*

**HAVALANDIRMAQ** *f.* 1. Coşdurmaq, qızışdırmaq, dəli eləmək.

2. Ruhlandırmaq, cuşa gətirmək, şövqə gətirmək. *Qəlbi havalandırır; El mahnısı, şikəstə.* M.Seyidzadə.

**HAVALANMA** "Havalanmaq"dan *f.is.*

**HAVALANMAQ** *f.* 1. Havaya qalxmaq, uçmaq. *Göyərçinlər havalandı. – Kamal bir-birinin ardınca bir çox təyyarənin havalanıb dik göyə ucaldığını gördü.* M.Rzaquluzadə. *Birdən* [sərçələr] *həyəcanla civildəşib havalandılar.* H.Seyidbəyli.

2. *məc.* Cuşa gəlmək, şövqə gəlmək, vəcdə gəlmək, ruhlanmaq, şövqlənmək. *Tülkü havalanıb deyir*: *– Aslanam; Top dağıdan ac aslanlar itibdi.* Aşıq Ələsgər. *Çal, havalan, santurum; Çal ki, tellər oynasın.* A.Şaiq.

3. *məc.* Azmaq, coşmaq, qızışmaq, özündən çıxmaq; tutması tutmaq, ağlı başından oynamaq. *Varlınan dost olub yoxsula gülmə; Çox da havalanıb coşma dünyada.* Aşıq Ələsgər. *Rəiyyət havalanacaq, Qədim kimilərinin qabağında heç fil də dayanmayacaq.* S.Rəhimov. *Salman havalanıb pörtərək eybəcər və iyrənc şəklə düşdü.* M.İbrahimov.

**HAVALI** *sif.* və *zərf* 1. Azğınlaşmış, qudurmuş; ağlı başından oynamış kimi; azğın, qudurğan. *Gəzirlər havalı ağalar, bəylər; İşləyir qan-tərdə naxırçı, nökər.* Aşıq Ələsgər. ☐ **Havalı kimi** – ağlı başından oynamış kimi, dəli kimi. *Xan havalı kimi bu otaqdan o otağa qaçır, .. sanki kimdənsə gizlənmək istəyirdi.* M.Rzaquluzadə. // Qızğın, qızmış, harın. *Xosrovdan başqa, heç kəs bu havalı ata səmt düşə bilmirdi.* S.Rəhimov.

2. Yaxşı havası olan; səfalı. *Havalı sahil. Havalı çəmənlik.*

**HAVASIZ** *sif.* və *zərf* Havası olmayan və ya pis olan; boğanaq. *Havasız otaq. – Qaldılar onun da lap alt qatında; İşıqsız, havasız, qıfil altında.* H.K.Sanılı. *Doğma əminin evi Səmədə günəşsiz, havasız bir zindan kimi görünürdü.* İ.Hüseynov.

**HAVATƏMİZLƏYƏN, HAVATƏMİZLƏYİCİ** *is.* Otağın və s. havasını təmizləyən

cihaz, qurğu; ventilyator. *Havatəmizləyəni quraşdırmaq.* // Sif. mənasında. *Havatəmizləyən ventilyasiya qurğuları.*

**HAVAYI** [*ər.*] 1. *zərf* İşləmədən, zəhmət çəkmədən, zəhmətsiz. *Düşündüm, ən nəhayət şair qəlbimə damdı; Süfrəsində havayı çörək yeyənləri vardı.* S.Rüstəm.

2. *zərf* Boş yerə, əbəs, nahaq, hədər. *Havayı axmasın nə su, nə külək; Tarlada bir qoza qalmasın gərək!* S.Vurğun. *Qoy hər bir əsgərimiz çox böyük və müqəddəs iş üçün vuruşduğunu bilsin, bir gülləni belə havayı atmasın.* Mir Cəlal.

3. *sif.* Boş, faydasız, dəyərsiz, mənasız, əsassız. *Havayı söhbət.* – [Şamama Cadu:] *Başına dönüm, elə bilirsən, mən sənə havayı söz deyirəm.* Ə.Haqverdiyev. [Qulu:] *Qulu heç vaxt havayı söz danışmamışdır.* İ.Əfəndiyev.

4. *zərf* Pulsuz, məccani, qarşılıqsız. *Havayı keçirmədi bir saatı, bir anı; Nizami Gəncəvinin "Leyli-Məcnun" dastanı; Onu vəcdə gətirdi...* B.Vahabzadə.

**HAVAYIYEYƏN** *is.* Özü işləməyib özgənin, ya özgələrin hesabına yaşayan adam; müftəxor, tüfeyli. // Sif. mənasında. *Quşun oxumağına şəhərin alverçi, baqqal, tacir, dəllal kimi havayıyeyən boşboğazları toplanırdı.* H.Sarabski.

**HAVİ** *sif.* [*ər.*] *kit.* Əhatə edən, qavrayan, ehtiva edən, içinə alan, aid olan, şamil olan. ..[Cənnətəli] *üç-dörd fərdi havi bir bənzətmə yazıb, neçə qəzet idarəsinə göndərib, çap eləməyiblər.* Çəmənzəminli. *Sarıköynək yaxşı bir qadın idi. Bir qadında bulunması lazım gələn bütün məziyyətləri havi idi.* S.Hüseyn.

**HAVLAMA** "Havlamaq"dan *f.is. Təzədən bir köpəyin havlaması onu diksindirdi.* S.Rüstəm.

**HAVLAMAQ** *f.* Hav-hav etmək, hürmək. *O, gözləri qızmış halda irəli yeridi və qoca çoban iti səsinə oxşayan gur səsi ilə havlamağa başladı.* Ə.Əbülhəsən.

**HAY** *təql.* 1. Çağırışa cavab. □ **Hay vermək** – çağırışa cavab vermək, səsə səs vermək. *Nə qədər çağırdımsa, hay vermədi. Adam çağıranda hay verər. – Diriyə hay verməz, ölüyə pay.* (Ata. sözü). *Küçədən acıqlı bir səs eşidildi: – Qırılmamışsınız ki, hay niyə vermirsiniz? Aç qapını..* M.İbrahimov.

2. Səs-küy, hay-küy, qarmaqarışıqlıq. □ **Hay basmaq** – hürərək səs-küy qoparmaq, səs-küy salmaq. [Salman ilə Maya] *alaçıqların güneyinə çıxan kimi ağılların yanından iki iri köpək hay basıb bu tərəfə cumdu.* M.İbrahimov. **Hay qopmaq** – b a x **hay düşmək**. **Hay düşmək** – hay-küy düşmək, gurultu-patırtı düşmək, hay qopmaq. [Əmiraslan baba dedi:] *İndiki kimi yadımdadır, hay düşdü. Biz də dəstə ilə yığılıb getdik...* S.Rəhimov. *Verdiyev .. qonum-qonşuya hay düşməmək üçün bir az asta danışdı.* Mir Cəlal. **Hay salmaq** – hay-küy qoparmaq, gurultu-patırtı qoparmaq, küy salmaq. *Mələk bilirdi ki, istədiyini verməsə* [uşaq] *hay salıb bağıracaq.* M.İbrahimov. [Uşaqlar] *bir-biri ilə ötüşərək hay salıb üzür, qabarıb gələn dalğanı qucaqlayır*(*lar*). Mir Cəlal. **Hay vurmaq** – qışqırmaq, bağırmaq, çığırmaq. *Hay vurdum, qıy vurdum, gətirməz şikar; Tərlan baxtım sara döndü, nə döndü!* Aşıq Ələsgər. *Cavabsız qalmamış hələ sualım! Hay vurur, qıy vurur tərlan xəyalım!* S.Vurğun.

3. **Hayında** şəklində – qeydində, fikrində. *Keçi can hayında, qəssab piy hayında.* (Məsəl). *Salman isə öz canının hayında idi.* Ə.Vəliyev. *Əcəl getdi, tər gəldi; Tərdən dərdi-sər gəldi; Mən qəriblik hayında; Bir də bədxəbər gəldi.* (Bayatı).

◊ **Haya bənd olmaq** – bir işi görmək üçün bəhanə, səbəb aramaq, fürsət gözləmək. *Bununla da, bir haya bənd imişlər kimi bayaqdan susmaqda olanların dilindən qıfıl götürüldü.* Ə.Əbülhəsən. **Haya yetmək** – imdadına çatmaq, harayına yetmək (gəlmək, çatmaq). **Hayına qalmaq** – qeydinə qalmaq, qayğısını çəkmək, qayğısında olmaq, fikrini çəkmək; haqqında düşünüb tədbir görmək. [Molla:] *Sənin kimi kişisinin hayına qalmayan arvaddan canım qurtarsın.* "M.N.lətif." **Mən nə haydayam, sən nə hayda(san), o nə hayda(dır)** – mən nəyin qeydini çəkirəm, sən nəyin qeydini çəkirsən, o nəyin qeydini çəkir; mən nə fikirləşirəm, sən nə fikirləşirsən, o nə fikirləşir. [Məşədi Ağabanı Fərəcullaya:] *Ala, çək, mən nə haydayam, sən nə haydasan.* M.Əliyev. [Məsmə:] *Qızım, başına hava gəlib, nədi, mən nə haydayam, sən nə haydasan.* Mir Cəlal.

**HAYAN[1]** *əvəz.* Hansı tərəf, hara, hansı səmt. [Sultan bəy:] *Mərdimazar oğlu mərdimazar, hayandan gəldi isə bütün işi korladı.* Ü.Hacıbəyov. *Namusu, qeyrəti hayana atdın; Düz çıxmadın etibara, gəlmədin.* Aşıq Şəmşir.

**HAYAN[2]** *is. dan.* Kömək, köməkçi, arxa, himayəçi, havadar. *Tellinin fikrinə gəldi ki, gedib Əcəb xalanı özünə hayan çağırsın.* S.Hüseyn. *Gəhi rəqibə salır meylini, gah aşiqinə; Hayan gəlir – əsir ol bivəfa, külək kimidir.* Ə.Vahid. ◻ **Hayan olmaq (durmaq)** – müdafiə etmək, arxa durmaq, havadarlıq etmək, himayə etmək, himayəçilik etmək. [Xəlil Çimnaza:] *..İndi gərək biz bir-birimizə hayan olaq.* M.Hüseyn. [Reyhan Əzizə:] *Gərək sən* [Azərdən] *ayrılmayaydın, yaxında qalıb ona hayan olaydın.* Ə.Məmmədxanlı.

**HAYDI** *nida.* Bir yerə getmək, yaxud bir işə başlamaq üçün çağırış və ya əmr mənasında işlədilir. *Haydı, işə başlayın! Haydı, irəli! Haydı, evə! – Bir qulaq ver: o haraydı, haydı, nərədi... Daş dilini anlamazsan, ey daş mühəndis!* M.Araz.

**HAY-HARAY, HAY-HUY** b a x **hay-küy** 1-ci mənada. *Obaya səs düşdü. Uşaqların hay-harayı bir-birinə qarışdı.* B.Bayramov. ◻ **Hay-haray salmaq** – b a x **hay-küy salmaq**. *– Usta! – Usta! Tufan gəldi! – deyə şagirdlər; Çaxnaşaraq mədən boyu hay-haray saldı.* S.Vurğun. *Dünyaya hay-haray saldı dəniz də*; *Xəzərin əlvida səsi ucaldı.* N.Xəzri.

**HAY-HAY** *is.* 1. *dan.* Tab, taqət, qüvvət, iqtidar, hey. *Hay-hayı gedib, vay-vayı qalıb.* (Məsəl).

2. İntonasiya ilə deyilərək istehza, rişxəndlik bildirir.

**HAYXIRIQ** *is.* Bəlğəm.

**HAYXIRMA** "Hayxırmaq"dan *f.is.*

**HAYXIRMAQ** *f.* Bəlğəm gətirmək, bəlğəm tüpürmək, boğazını arıtlamaq. *Kərbəlayı Qurban çubuğu doldurub almışdı ağzına və hərdən hayxırıb, ağacın dibinə tüpürürdü.* Çəmənzəminli.

**HAYIL-MAYIL** *zərf dan.* Heyran, valeh. ◻ **Hayıl-mayıl qalmaq** – heyran qalmaq, heyrət etmək. **Hayıl-mayıl qoymaq** – heyran qoymaq, heyrətdə qoymaq. **Hayıl-mayıl olmaq** – heyran olmaq, heyrət etmək. *İbrahim, padşahın gözünə çox xoş gəlmişdi. Day lap hayıl-mayıl olmuşdu.* (Nağıl). [Tükəzban xala:] *Ölməmişlər elə də qəşəngdirlər ki, adam hayıl-mayıl olur, heç bilmir hansının qolundan yapışsın..* İ.Şıxlı.

**HAY-KÜY** 1. *is.* Səs-küy, qışqırtı, bağırtı, hay-haray, gurultu, qalmaqal, dava, mərəkə. *Bir gün Nəbi Zəngəzur mahalında kiçik bir kəndin yanından keçərkən qulağına hay-küy səsi gəlir.* "Qaçaq Nəbi". *Yaylanın başından hay-küy səsi gəlirdi.* Mir Cəlal. ◻ **Hay-küy salmaq (qaldırmaq)** – qışqırmaq, bağırmaq, səs-küy salmaq. *Səlim böyük hay-küy qaldırdı.* M.İbrahimov. [Ümid Mikayıla:] *Son vaxtlar* [Səfiyarın] *hay-küy salıb özündən çıxması da bunun üstündədir.* B.Bayramov. // Səs-küy. *Adətən limana yaxınlaşan gəmilərdə yaman hay-küy olur.* M.Rzaquluzadə. ◻ **Hay-küy salmaq** – bərkdən danışmaq, səs-küy salmaq. *Sadıqzadə əlini qaldırıb hay-küy salan gəncləri sakit etməyə çalışdı.* S.Rəhimov.

2. **Hay-küylə** şəklində *zərf* – hay-küy salaraq, qışqıraraq, bağıraraq.

**HAY-KÜYÇÜ** *sif.* Heç bir ciddi səbəb olmadan hay-küy salan, çaxnaşma salan, vahiməyə düşən; küy-kələkçi, küyçü.

**HAY-KÜYLÜ** *sif.* Hay-küy, səs-səmir olan.

**HAY-KÜYSÜZ** *zərf* Hay-küy salmadan, sakitcəsinə, sakit, səsə salmadan.

**HAYQIRIQ** *is.* Qışqırıq, bağırıq, hay-küy, səs-küy. *Qadın və kişilərin əl-ələ tutuşub yallı getmələri və hayqırıqları hələ də dağlardan çəkilməmişdi.* S.Rəhimov.

**HAYQIRIŞMA** "Hayqırışmaq"dan *f.is.*

**HAYQIRIŞMAQ** *qarş.* Səs-səsə verib qışqırmaq, bağırmaq, qışqırışmaq. *Uşaqlar hayqırışırdılar.*

**HAYQIRMA** "Hayqırmaq"dan *f.is.*

**HAYQIRMAQ** *f.* Qışqırmaq, bağırmaq, hay salmaq. *Hayqırıb meydanda açsam qolqanat; Qarı düşman qabağımda olar mat.* "Koroğlu". *Mən əzilən bir sinfin hayqıran; Haq bağıran sədasından yarandım.* M.Müşfiq.

**HAYQIRTI** *is.* Çığırtı, bağırtı, qışqırıq, hay-küy. *Bu meşəlikdə çaylar axır, çeşmələr qaynayır, vəhşi heyvanların hayqırtısı eşidilirdi.* S.Rəhimov.

**HAYLAMA** "Haylamaq"dan *f.is.*

**HAYLAMAQ** *f.* Səsləmək, çağırmaq. *Qapını döydük, açan olmadı. Hayladıq, cavab çıxmadı.* C.Cabbarlı. *Surxay atını Qulunun çəpəri yanına sürdü və ucadan hayladı: – Qulu, ay Qulu!* M.İbrahimov. // Heyvanları səsləyib çağırmaq. *Bu söhbətdən Cəbiş pərt olub atlarını hayladı.* S.Rəhimov. *Sarban həyəcanla dəvələri haylayır..* M.İbrahimov.

**HAYLAŞMA** "Haylaşmaq"dan *f.is.*

**HAYLAŞMAQ** *qarş.* Biri-birini səsləmək, çağırmaq.

**HAYLAZ** *is.* Vaxtını boş-boşuna, səmərəsiz keçirən adam, işə çıxmayan, işləməyi sevməyən adam; tənbəl, xeyirsiz adam. [Camaat:] *Alçaq, haylaz!* H.Cavid.

**HAYLAZLIQ** *is.* Haylaz adamın xasiyyəti.

**HAYLI-KÜYLÜ** b a x **hay-küylü**. *Dəli dağ nə qədər haylı-küylü, nə qədər vahiməli-qorxulu olsa da .. hər dağdan daha məftunedici gəlirdi.* S.Rəhimov.

**HAZIR** *sif.* və *zərf* [*ər.*] 1. Bir işi icra etmək üçün lazım olan hər şeyi olan; amadə. *Mən hazıram, gedə bilərik. Yola düşməyə hələ hazır deyil. Çıxışa hazır olmaq. – Qapının ağzında nökər Vəli hazır durubdur.* Ü.Hacıbəyov. *Qanadın üstündə o mehribanım; Uzanıb deyir ki: "Mən hazıram, sür".* M.Rahim.

2. Bir işi görməyə razı olan, həvəs, meyil göstərən. *O bizimlə getməyə hazırdır. Sizi saatlarla dinləməyə hazıram. – Zeynal Şərifzadənin göstərəcəyi yol ilə getməyə hazır idi.* S.Hüseyn. *Çarpışmağa biz hazır; Yerlərlə, fələklərlə.* A.Şaiq.

3. Hazırlanmış; işlənməyə, istifadəyə yarar vəziyyətdə olan. *Nahar hazırdır. Maşın hazırdır, bizi gözləyir. – Stolun üstündə nə ki lazım idi, hamısı hazır olmuşdu.* N.Nərimanov. *Bir az keçmədən çay hazır oldu.* Ə.Vəliyev. // Tikilmiş və ya hazırlanmış halda satılan (*sifarişli* ziddi). *Hazır paltar. Hazır ayaqqabı. Hazır şalvar.* // Qabaqcadan düşünülmüş, qabaqcadan fikirdə tutulmuş, hazırlanmış (söz, cavab və s. haqqında). *Hazır cavab. Hazır ibarələr.* // Hazırlanmış, yetişdirilmiş, öyrədilmiş, təlim keçmiş. *Hazır mütəxəssis.* – [Əhməd Salmana:] *Oxumalıyıq.. Sonra bir müddət keçmiş, hazır kadrımız da olar, kiçik bir təşkilat yaparıq.* Çəmənzəminli.

4. Söhbəti gedən yerdə olan, şəxsən orada iştirak edən (*qaib* ziddi).

5. İndi ki, madam ki, lap yerində. *Hazır gəlmisən, bu işi də gör. Hazır yazırsan, bu sözləri də əlavə et.*

6. **Hazırda** şəklində *zərf* – indi, bu saat, indilikdə, indiki halda. *Hazırda Atabəy məmləkətlərinin bir tək müttəfiqi və dostu yoxdur.* M.S.Ordubadi. *İçərişəhərin hazırda beş darvazası varsa da, keçmişdə bunlar dörd imiş.* H.Sarabski.

◊ **Hazıra qonmaq** – başqalarının əməyi ilə meydana gəlmiş bir şeyə şərik çıxmaq. **Hazıra nazir** – başqalarının əməyi ilə meydana gətirilmiş bir şeyə şərik çıxmaq istəyən və ya şərik çıxan adam haqqında. **Hazıra (hazırına) nazir olmaq** – b a x **hazıra qonmaq**. [Ata:] *Müftə çörəyi sən yeyirsən, hazırına nazir olmusan.* Ə.Vəliyev. **Hazır ol!** *hərb.* – hazırolma komandası. *Bayraqdarların dalınca gedən şeypurçular qoşuna "Hazır ol!" – işarəsi verincə, qırx min qılınc bir kərə qınından çıxdı.* M.S.Ordubadi.

**HAZIR-AMADƏ** b a x **hazır** 1-ci mənada. *Hazır-amadə durmaq.*

**HAZIRCAVAB** *sif.* [*ər.* hazir və *fars.* cəvab] Başqasının sözünə və ya sualına dərhal münasib cavab tapıb söyləyə bilən, söz altında qalmayan. *Hazırcavab adam.* – [Zeynəb xanım] *həmişə hazırcavab, sözü üzə dik söyləyən idi.* Çəmənzəminli. [Məmmədəli:] *Mənim qardaşım Məmmədcəfər çox hazırcavabdır.* S.Rəhman.

**HAZIRCAVABLIQ** 1. *is.* Hazırcavab adamın hal və keyfiyyəti; hazırcavab olma, söz altında qalmama. *Onun hazırcavablığı hamını valeh edir.* – [Mədinənin] *mehribanlığı, zarafatı, qonaqsevərliyi, hazırcavablığı Vaqifi məftun edirdi.* Çəmənzəminli. *Qızın bu hazırcavablığı Aslanı sevindirdi.* S.Vəliyev.

2. **Hazırcavablıqla** şəklində *zərf* – birinin sözünə və ya sualına dərhal münasib cavab verərək, söz altında qalmayaraq. *Sirat bu sualı gözləyirmiş kimi, hazırcavablıqla, bir az da ötkəm dedi..* Ə.Əbülhəsən. *Sənubər çətin sualın cavabını asanlıqla tapmış adamların özündənrazı ədası ilə sakitcə, hazırcavablıqla ..* [dedi] B.Bayramov.

**HAZIRKI** *sif.* Keçmişdə və gələcəkdə deyil, indi, hazırda olan; indiki. *Hazırkı zaman. Hazırkı vəziyyət. Kəndin hazırkı mənzərəsi.* – [Qızıl Arslan:] *Sənə çox gözəlcə məlumdur ki, hazırkı hökmdarlıq atamız Eldənizin qılıncı və rəhmətlik anamız Türkan xatunun tədbirləri sayəsində düzəlmişdir.* M.S.Ordubadi.

**HAZIRLAMA** “Hazırlamaq”dan *f.is.*

**HAZIRLAMAQ** *f.* 1. İşlətmək və ya istifadə üçün yararlı hala salmaq, hazır etmək. *Avtomaşını yola hazırlamaq. Vannanı hazırlamaq. Yorğan-döşəyi hazırlamaq. – Mələk penisillin iynəsini vuraraq bankaları hazırlayırdı.* M.İbrahimov. *Şahmar yola düşmək üçün yenidən hazırladığı çamadanı da götürüb babasının yanına keçdi.* B.Bayramov. // Hər hansı məqsəd üçün öyrətmək, lazımi bilik vermək, təlim etmək. *Kadr hazırlamaq. Mütəxəssislər hazırlamaq. Uşağı birinci sinfə hazırlamaq. – İndi də diş həkimləri hazırlamaq üçün texnikum düzəldirlər.* C.Məmmədquluzadə. *Müəllim olmaq bir zövq isə müəllim hazırlamaq min bir zövqdür.* S.Rəhimov.

2. Bir şeyi yerinə yetirmək, həyata keçirmək üzərində çalışmaq, əlləşmək. *Rolunu hazırlamaq. Tamaşa hazırlamaq. Layihə hazırlamaq.*

3. Xörək və s. bişmiş bişirmək, bişmiş hazır etmək. *Xörək hazırlamaq. Qəlyanaltı hazırlamaq. Uşaq üçün südlüsıyıq hazırlamaq. – Müşgünaz çayı dəmə qoyub mətbəxdə Ənvər üçün xörək hazırlayırdı.* Ə.Vəliyev. // Çay qoymaq. *Gülsənəm arvad səhər tezdən qalxıb sobanı qalamış və oğlu üçün çay hazırlamışdı.* M.Hüseyn. // Süfrə salmaq, yemək-içmək üçün lazım olan hər şeyi süfrə üzərinə qoymaq. *Süfrəni də nə zamandır; hazırlamış evdə nənə.* M.Dilbazi.

4. Sonradan işlətmək üçün tədarük etmək, ehtiyatını görmək, hazır etmək. *Heyvanlar üçün yem hazırlamaq. Qışa odun hazırlamaq.* – [Mehriban] *..Zeynalın sevdiyi içkini bazardan aldırıb hazırlar və süfrəyə gətirərdi.* S.Hüseyn. *Uşaq qələm və mürəkkəb-kağız hazırlayıb nə yazacağını gözlədi.* Ə.Vəliyev.

5. Bir iş görmək niyyətində olmaq, bir şey etməyə hazırlaşmaq, bir şey qurmaq. *Hiylə hazırlamaq. Tələ hazırlamaq.*

6. Qayırmaq, düzəltmək. *Dərman hazırlamaq. Metaldan detallar hazırlamaq. Fabrik üsulu ilə məmulat hazırlamaq.* – [Tapdıq] *iki gün əlləşdi. Ancaq şananın barmaqlarını hazırlaya bildi.* Ə.Vəliyev. *Aslan və yoldaşlarının hazırladığı maket orada idi.* M.Rzaquluzadə.

7. Qabaqcadan düşünüb yazmaq, tərtib etmək, hazır etmək. *Ərizə hazırlamaq. Rəisin adına məktub hazırlamaq.* // Qabaqcadan düşünüb nəzərdə tutmaq, hazır etmək, yadda saxlamaq. *Cavab hazırlamaq. – Elə bil Zeynal cavabını qabaqcadan hazırlamışdı.* B.Bayramov.

8. Olmuş və ya gözlənilən acı bir hadisə xəbərini dərk etmək üçün birində qabaqcadan müvafiq əhval-ruhiyyə yaratmaq.

**HAZIRLANMA** “Hazırlanmaq”dan *f.is.*

**HAZIRLANMAQ** 1. “Hazırlamaq”dan *məch. Patronlar yoxlanıldı, qumbaralar, pulemyotlar hazırlandı.* Ə.Vəliyev. // Hazırlıq işləri aparılmaq. *Bayrama hazırlanmaq. Qonaqları qarşılamağa hazırlanmaq. – Hələ Novruza və çərşənbələrə hazırlanmaq daha da böyük bir maraq təşkil edərdi.* Çəmənzəminli.

2. *f.* Hazır olmaq, özünü hazırlamaq, hazırlaşmaq. *Bayrama hazırlanmaq. – Vaxt keçmişdi, çayçı, dükanının qapılarını içəridən bağlayıb yatmağa hazırlanırdı.* S.Hüseyn. *Məhərrəm cavab vermək üçün hazırlandı.* H.Nəzərli.

3. *məch.* Qayrılmaq, düzəldilmək. *Əlavə çoxlu ehtiyat hissələri hazırlandı. – Bu hissələr hazırlandıqca bir-birinin ardınca zavoda göndərilirdi.* H.Seyidbəyli.

**HAZIRLAŞDIRILMA** “Hazırlaşdırılmaq”-dan *f.is.*

**HAZIRLAŞDIRILMAQ** *məch.* Hazır edilmək, hazır hala salınmaq.

**HAZIRLAŞDIRMA** “Hazırlaşdırmaq”dan *f.is.*

**HAZIRLAŞDIRMAQ** *f.* Hazır etmək, hazır hala salmaq. *Müəllimim mənə söylədiyi kimi, mən də onlara cürbəcür hekayələr söylərdim və onları gələcək həyata hazırlaşdırmağa çalışardım.* T.Ş.Simurq.

**HAZIRLAŞMA** “Hazırlaşmaq”dan *f.is.*

**HAZIRLAŞMAQ** *f.* 1. Bir iş görmək və ya bir yerə getmək üçün hazırlıq görmək, hazırlanmaq, özünü hazır etmək. *Yola düşməyə hazırlaşmaq. Köçməyə hazırlaşmaq. – ..Bir istəkan çay içib, bir tikə çörək yeyib hazırlaşdım evdən çıxmağa.* C.Məmmədquluzadə. [Qəhrəman:] *Hər iki tərəf qəti hücuma hazırlaşırdı.* H.Nəzərli.

2. Oxuyub öyrənmək, bir şey üzərində işləmək, çalışmaq. *Fizikadan hazırlaşmaq. Mühazirələrə hazırlaşmaq. Universitetə girməyə hazırlaşmaq. – Bütün qrup bir neçə briqadaya bölünür, briqadanın rəhbərliyi ilə dərsə hazırlaşırdı.* Mir Cəlal. [İkram] *kəndə getməsəydi dostu Məmməd onun yanına gələcək, fizikadan imtahan vermək üçün oxuyub yaxşı hazırlaşacaqdılar.* Ə.Əbülhəsən.

**HAZIRLATMA** "Hazırlatmaq"dan *f.is.*

**HAZIRLATMAQ** *icb.* Hazır etdirmək. *Tikinti materialları hazırlatmaq. Qış üçün yem hazırlatmaq.*

**HAZIRLIQ** *is.* 1. Bir iş görmək üçün hazırlaşma, hazır olma. *Yaz əkininə hazırlıq. –* [Ceyranın] *fikrinə gəlir ki,* [Eldar] *bəzi hazırlıqlar üçün evə getmişdir.* S.Hüseyn. *Ehtiyat xala bütün gecəni oğlu ilə, onun səfər hazırlığı ilə məşğul oldu.* Mir Cəlal. ☐ **Hazırlıq aparmaq** – b a x **hazırlıq görmək**. [Atabəy:] *Sabahdan başlayaraq ordunun hərəkəti üçün hazırlıq aparmalısınız.* M.S.Ordubadi. **Hazırlıq görmək** – bir iş üçün lazımi tədarüklər görmək. *Yola hazırlıq görmək. Bayrama hazırlıq görmək. – Kor padşah bir gün vəzir-vəkilini çağırıb, əmr elədi ki, hazırlıq görsünlər.* (Nağıl). [Zahidoğlu] *şofer Bağdadı çağırıb səfər üçün hazırlıq görməyi ona tapşırdı.* S.Rəhimov.

2. Məşğələ, dərs, mütaliə prosesində əldə edilən bilik ehtiyatı. *İmtahanda hazırlığını nümayiş etdirmək. Hazırlığı olmamaq. Hazırlıq dərəcəsi.*

3. Tədarük edilmiş şey; tədarük. *Taxıl hazırlığı. Pambıq hazırlığı. – Novruz öz atları və özü üçün Culfadan hazırlıq götürəcəkdi.* M.S.Ordubadi.

**HAZIRLIQLI** *sif.* Hazırlığı (2-ci mənada) olan. *Hazırlıqlı kadrlar yetişdirmək. Hazırlıqlı tələbə.*

**HAZIRLIQSIZ** *sif.* 1. Hazırlığı (2-ci mənada) olmayan. *Hazırlıqsız tələbə. –* [Mürsəl] *çətin suallara tutulan hazırlıqsız bir məktəbli vəziyyəti almışdı.* Mir Cəlal. // *zərf* Qabaqcadan hazırlaşmamış, hazırlaşmadan, hazır olmadan. *Hazırlıqsız imtahana girmək. Hazırlıqsız cavab vermək.*

2. Qabaqcadan hazırlığı görülməmiş, qabaqcadan hazırlanmamış, qabaqcadan tədbirləri görülməmiş. *Hazırlıqsız iclas.*

**HE** "H" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**HECA** *is.* [*ər.*] Sözdə bir dəfə nəfəs verməklə tələffüz olunan səs və ya səs birləşməsi. *Sözü hecalara ayırmaq. "Atalıq" sözündə üç heca var*: *a-ta-lıq.* ☐ **Açıq heca** *qram.* – axırında samit olmayan heca. **Qapalı heca** *qram.* – axırında samit olan heca. **Heca vəzni** *ədəb.* – müəyyən miqdarda hecaya əsaslanan şeir ölçüsü. *Fərq etsə də əruzu hecadan qələt-qələt; Hər yerdə göstərər özünü "əhli-mərifət".* Ə.Vahid.

**heca-heca** *zərf* Hecalara ayıraraq, hecalayaraq, hecalarla. *Heca-heca oxumaq.*

**HECALAMA** "Hecalamaq"dan *f.is.*

**HECALAMAQ** *f.* Hecalarla, hecalara ayıraraq oxumaq; höccələmək.

**HEÇ** *zərf* [*fars.*] 1. Qətiyyən, əsla, bilmərrə, büsbütün. *Bu barədə heç təsəvvürüm yoxdur. Bu hadisədən heç xəbərim yoxdur. Heç başa düşmədim ki, nə deyir. Onu heç sayan yoxdur. –* [Məşədi İbad:] *Heç başa düşmürəm ki, bu nə işdir?* Ü.Hacıbəyov. *Babam derdi*: *"Keçən günə gün çatmaz"; Mənim könlüm bu sözlərə heç yatmaz.* M.Müşfiq.

2. *əd.* Sual cümlələrində cümlənin sual səciyyəsini gücləndirmək üçün işlədilir. *Heç xəbərin varmı ki, müdirimiz xəstələnib? Heç görmüsən ki, ilin bu vaxtında qar yağsın? Heç belə külək olar? –* [Səkinə xanım:] *Gülsəba, heç bilirsən ki, mənim bu bihəya qardaşım arvadı başıma nə iş gətiribdir?* M.F.Axundzadə. [Natiq:] [Sona] *heç səhərlər Xəzərə baxmısanmı?* B.Bayramov.

3. *İs. mənasında.* Heç bir qiyməti, dəyəri, hörməti olmayan adam və ya şey haqqında. *Zəhmət çəkməyən adam heçdir. Bu onun qabağında heçdir. – Utanmazmı Füzulinin adını çəkən, özü bir heçkən.* M.Müşfiq.

4. Puçluq, yoxluq, fanilik, ölüm bildirir. *Barmağım beşdi mənim; Günlərim keçdi mənim; Cəfa çəkdim, yurd saldım; Axırım heçdi mənim.* (Bayatı). [Rüstəm bəy] *bir neçə dəqiqə bu halda dayandı, fərsiz gözlərini bir nöqtəyə dikdi və yenə mənasız yoxluğa daldı. Varlıq nəzərində heçə çevrildi.* Çəmənzəminli.

5. Sual cümlələrində bir şeyin, işin vaxtilə və ya hazırda olub-olmadığını, baş verib-vermədiyini, edilib-edilmədiyini müəyyənləşdirmək üçün işlənir. *Heç ova getmisən? Heç xaricdə olmusan? Heç ceyran əti yemisən? Heç papiros çəkmisən?* // Hər hansı bir vaxtda və yerdə; əzqəza, təsadüfən. *Bu adamı heç görmüsən? Heç belə şey görməmişəm.*

6. *ara s.* Əvvəlki sual və ya cavabdan fikri yayındırmaq məqsədilə işlədilir. *Heç, elə bir şey yoxdur. Heç, başqa şey məni düşündürür. Heç, fikrim özgə yerdədir.* – [Sultan bəy:] *Heç, bir gədə var idi, arşınmalı satardı.* Ü.Hacıbəyov.

7. **Heçdən** şəklində – 1) ortada, əldə heç bir şey olmadan, yoxdan, sonradan, yaxud çox cüzi, əhəmiyyətsiz bir şeydən. *Heçdən bir şey düzəldib ortaya çıxarmaq. Bu şeylərin hamısı heçdən yaradılmışdır. Heçdən dövlət qazanmaq;* 2) heç bir səbəb, əsas olmadan. *Heçdən dava salmaq. Heçdən incimək.*

◊ **Heç bir** – inkar cümlələrində inkarı gücləndirmək üçün işlənir. *Heç bir şübhə yoxdur. Heç bir hüququ olmamaq. İşdə heç bir irəliləyiş nəzərə çarpmır. Səhərdən heç bir iş görə bilməmişəm.* – [Sərvər:] *Sən atana heç bir söz demə və söz açsa, deyinən ki, özün bilərsən.* Ü.Hacıbəyov. *Əşrəf həyatında hələ heç bir qəhrəmanlıq eləməmişdi.* S.Rəhman. **Heç biri** – toplu halında olan şeylərdən, adamlardan və s.-dən biri də olsa (adətən inkar cümlələrində). *Heç biri xoşuma gəlmədi. Heç biri suala əməlli cavab verə bilmədi. Heç biri köməyə gəlmədi. – Heç biri dinib-danışmırdı.* M.Hüseyn. **Heç cür** – qəti surətdə, qətiyyən. *Oğlan uşağı atasına sarvaşıb qışqırıq qopardı və heç cür ondan ayrılmaq istəmədi.* M.İbrahimov. *Teymur qızı diqqətlə süzür, heç cür təslim olmaq istəmirdi.* H.Seyidbəyli. **Heç də** – əsla, o cür yox, o qədər də. *Heç də elə deyil. – Naşad əfəndi heç də mətləbə dəxli olmayan lüzumsuz sözlər ilə* [Mehribanın] *canını sıxırdı.* S.Hüseyn. *Arvadın bu hərəkəti Rüstəm kişiyə heç də xoş gəlmədi..* M.İbrahimov. **Heç bir şey** – 1) b a x **heç nə**. *Heç bir şeydən qorxmur. – Hava qaranlıq olduğundan heç bir şey görünməyirdi.* M.Hüseyn. *Anası oğlunun sözündən heç bir şey başa düşmədi.* Ə.Vəliyev; 2) boş bir şey, cüzi bir şey, əhəmiyyətsiz şey. *Heç bir şeyin üstündə dava salmaq.* **Heç bir vaxt (zaman)** – qətiyyən, əbəda, əsla, heç vaxt, bir də, daha. *Bu hadisə heç bir vaxt təkrar edilməyəcəkdir. Heç bir vaxt onu görməyəcəyik.* – [Səlim:] *Haqsızlıq əfv olunmaz heç bir zaman.* H.Cavid. **Heç etmək** – yox etmək, heçə çıxarmaq, məhv etmək. *Qurbani der: bəsdir məni puç etdin; Zəhmətimi, həm səyimi heç etdin.* Qurbani. **Heç hənanın yeridir** – yersiz, münasibətsiz görülən bir iş və ya deyilən bir söz haqqında. **Heç kəs** – heç bir adam, heç bir şəxs. *Heç kəs məni başa düşmür. Heç kəsə icazə verilmir. Sirri heç kəsə deməmək. – ..Qəzetçi gərək heç kəsi özündən incitməsin.* C.Məmmədquluzadə. *Heç kəs Ağazala söz qaytara bilmir, onun qabağında dillənən olmur.* Ə.Əbülhəsən. **Heç kəs heç kəsin kağızını (kitabını) oxumur** – qanuna riayət edən yoxdur, özbaşınalıqdır, intizamsızlıqdır, hər kəs istədiyini edir. **Heç kəsin toyuğuna kiş deməz (daş atmaz)** – çox sakit, zərərsiz, ehtiyat gözləyən adam haqqında. *Heç kəsin toyuğuna ömrümdə kiş demədim.* B.Vahabzadə. **Heç kim, heç kimsə** – b a x **heç kəs**. *Onun heç kimsəsi yoxdur.* – [Səttar bəy:] *Səlbinazın heç olmasa anası var, qovmusan, gedib evlərinə, bunun heç kimi yoxdur.* N.Vəzirov. **Heç kimin (kəsin) ərizəsini oxuyan yoxdur** – b a x **heç kəs heç kəsin kağızını (kitabını) oxumur**. **Heç nə** – b a x **heç zad**. [Nurəddini analığı Gülpəri] *teztez söyərdi və heç nə üstündə döyərdi.* S.S.Axundov. *Vahidin heç nəyə meyli yox idi.* Mir Cəlal. **Heç olmaq** – b a x **heçə çıxmaq**. *Bütün arzularım heç oldu.* **Heç olma(z)sa** – arzu bildirir – barı, yaxşı olardı ki. *Heç olmazsa bir az dincəl. – Hacı Rüstəm burada da çalışırdı ki, bir neçə şahı, heç olmasa bir neçə qəpik saldırsın.* Ə.Haqverdiyev. [Əsgər:] *Bəs mən qızı harada görüm və nə*

*sayaq görüm ki, heç olmasa bir balaca bələd olum?* Ü.Hacıbəyov. **Heç saymaq** – qətiyyən saymamaq, adam yerinə qoymamaq, hesablaşmamaq. **Heç şey** – b a x **heç bir şey**. *Heç şeyə baxan deyil. Heç şeydən qorxmur. Heç şeydən ötrü özündən çıxmır.* **Heç vaxt (zaman)** – b a x **heç bir vaxt (zaman)**. *İndi, ya heç vaxt. Heç zaman belə şeyə razı olmaq olmaz. –* [Lətifə] *heç vaxt beş-on dəqiqədən artıq gecikməzdi..* M.Hüseyn. *Yox, Teymur bu adamı heç vaxt unutmayacaq.* H.Seyidbəyli. **Heç yanından ötməyib (keçməyib)** – heç xəbəri yoxdur, nə olduğunu heç bilmir, görməyib, eşitməyib. *Mədəniyyətin heç yanından ötməyib* (*keçməyib*). **Heç yox** – qətiyyən, əsla. **Heç zad** – heç bir şey, heç nə. *Əlində heç zad yoxdur. – Gecə yarısı Feyzullahın arvadını, uşaqlarını ürəkqopma azarına salıb, evin altını üstünə çevirdilər, heç zad tapa bilmədilər.* Ə.Haqverdiyev. [Mirhadi:] *Düzü, indiki həkimlər heç zad bilmirlər.* Qantəmir. **Heçə çıxartmaq** – 1) b a x **heç etmək**. *Arzularını heçə çıxartmaq;* 2) bütün əhəmiyyətini, dəyərini, ləyaqətini rədd etmək, yox etmək. *Zəhmətini heçə çıxartmaq.* **Heçə çıxmaq** – heç olmaq, puç olmaq, yox olmaq, itmək, baxmaq, hədər getmək, nəticəsiz qalmaq. *Bütün zəhmətim heçə çıxdı.* **Heçə getmək** – məhv olmaq, boşa çıxmaq, puç olmaq. *Zəhməti heçə getdi. – ..Mənim də gəncliyim heçə getməzdi.* S.Vəliyev.

**HEÇLİK** *is.* 1. Yoxluq, fanilik, ədəm, mövcud olmama (*varlıq* ziddi). *Ölüm bir iblisdir, həyat bir mələk! Varlığı izləyir heçlik kölgətək.* S.Vurğun. [Məhəmməd:] *Varlığı heçliyə mən dəyişərdim; Əgər bu dünyada sən olmasaydın.* B.Vahabzadə. // Məc. mənada. *Buludlar yığışır üstümə lay-lay; İçimdə bir boşluq, heçlik duyuram.* S.Vurğun. // *məc.* Fəza, boşluq. *Seyr etdim o heçlikləri mən də; Çırpındı könül matəm içində.* H.Cavid. *Sağır göy altında gələrək vəcdə; Sonsuz bir heçliyə eylədi səcdə.* M.Müşfiq.

2. *məc.* Mənasızlıq, boşluq, naçizlik, miskinlik. *Sadıq da, Xəlil də "danabaşlıların" həyatının bütün heçliyini, mənasızlığını görür və dərk edir.* M.İbrahimov.

**HEÇ-PUÇ** *is.* [*fars.*] Heç bir əhəmiyyəti, xeyri, mənası olmayan şey, boş şey. *Məsələ heç-puç üstündə başlayan söhbətdə deyil.* Y.Əzimzadə. *Əlikram əcəb başa düşürdü ki, Sənubərin dediklərinin hamısı heç-puç deyildir..* B.Bayramov. ◻ **Heçə-puça çıxarmaq** – b a x **heçə çıxarmaq**. **Heçə-puça vermək (satmaq)** – çox ucuz, çox aşağı qiymətə satmaq. *Malını heçə-puça satmaq.*

**HEÇ-HEÇƏ** *zərf* Hər iki tərəf üçün uduşsuz və ya məğlubiyyətsiz (müxtəlif oyunlarda, yarışlarda). *Fit verilir, qurtarır oyun heç-heçə.* M.Rahim.

**HEGELÇİ** is. Hegel fəlsəfəsi tərəfdarı (b a x **hegelçilik**).

**HEGELÇİLİK** [*xüs. is.*-dən] İdealist dialektika nəzəriyyəsinin əsasını qoymuş alman filosofu Hegelin dünyagörüşü; Hegel fəlsəfəsi əsasında təşəkkül tapmış idealist fəlsəfi cərəyanların ümumi adı.

**HEGEMÓN** [*yun.*] Hegemonluq edən; rəhbər, başçı.

**HEGEMONÍZM** [*yun.*] Hegemonluq iddiasında olma, hegemonluğa can atma, özünü hegemon kimi aparma.

**HEGEMONLUQ** *is.* Birincilik, rəhbərlik; gücdə, təsirdə üstünlük; hakimiyyət, ağalıq.

**HEKAYƏ** *is.* [*ər.*] 1. Rəvayət şəklində kiçik ədəbi nəsr əsəri. *Mirzə Cəlilin hekayələri. – Ədibin kəskin publisist qələmi "Pir" kimi çox realist bədii hekayədə də özünü göstərir.* M.Arif. *Konsertdən sonra radio ov haqqında maraqlı bir hekayə verdi.* M.Rzaquluzadə.

2. B a x **hekayət**. [Uşaqları] *gördükdə "qəbz" məsələsi başımda təzələndi və .. hekayə gəlib gözlərimin önündən keçdi.* Çəmənzəminli. *Maya hekayəsini qurtaranda doğrudan da ağlayan Səkinə ilə Pərşan bir daha onu qucaqladılar.* M.İbrahimov. // Bir vaqiə, ya hadisəni nəql etmə, bir-bir danışma. ◻ **Hekayə etmək** – b a x **hekayət etmək** ("**hekayət**"də). *Qız öz sərgüzəştini hekayə etməyə başlamışdı.* S.Hüseyn.

**HEKAYƏYAZAN** *is.* və *sif.* b a x **hekayəçi** 1-ci mənada.

**HEKAYƏT** *is.* [*ər.*] Əhvalat, sərgüzəşt, qəziyyə; hekayə. *Mən çəlik ürəkli bir yeni gəncəm; Dildən-dilə düşmüş hekayətim var.* M.Müşfiq. *Qüdrət Şirmayının hekayətini dinləyəndə gülməkdən özünü güclə saxlayırdı.*

M.Hüseyn. ◻ **Hekayət etmək** – danışmaq, nəql etmək, söyləmək (sərgüzəşt, qəziyyə və s.). *Qəmli mazisini hekayət edər; Taleyindən bütün şikayət edər.* A.Səhhət. *Nə çəkmişsə aylar, illər uzunu; Birər-birər eyləyirdi hekayət.* M.Müşfiq.

**HEKAYƏÇİ** *is.* 1. Hekayə yazan yazıçı. *Ə.Haqverdiyev gözəl hekayəçidir.*

*2.* Rəvayətçi, hekayə, rəvayət danışan adam.

**HEKAYƏÇİLİK** *is.* Hekayə yazma sənəti. *Romançılıq və hekayəçilik həyat və tarixi təhrif etmək deyil, onu bədii şəkildə vermək deməkdir.* M.S.Ordubadi.

**HEKTÁR** [*yun.* hekaton – yüz və area – sahə] Metr sistemində 10.000 $m^2$-ə bərabər sahə ölçüsü.

**hekto...** [*yun.* hekaton – yüz] Ölçü vahidi bildirən mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, “yüz”, “yüz dəfə” mənasını ifadə edir; məs.: hektolitr (yüz litr), hektometr (yüz metr) və s.

**HEKTÓQRAF** [*yun.* hekaton – yüz və grapho – yazıram] Yazı maşınında və ya əllə yazılmış yazını və şəkli çoxaltmaq üçün sadə çap aləti.

**helio...** [*yun.* helios – günəş] Mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, günəşə, yaxud günəş şüalarına aidliyi bildirir; məs.: helioskop, heliofizika, helioterapiya, heliotexnika.

**HELİOTÉXNİKA** [*yun.* helios və technike] Texnikanın, günəş enerjisinin sənaye və məişətdə istifadə edilməsi ilə məşğul olan sahəsi.

**HELİUM** *is.* [*yun.*] *kim.* Sıfır qrupundan kimyəvi element.

**HELMİNTOLÓGİYA** [*yun.* helma – parazit, qurd, bağırsaqqurdu və logos – elm] Tüfeyli qurdlardan və onların törətdiyi xəstəliklərdən bəhs edən elm.

**HEMATOGÉN** [*yun.* haima – qan və genos – doğuş] Dərman preparatı; qliserin və şərabda həll olunmuş məhlul.

**HEMATOLOGİYA** *is.* [*yun.*] *tib.* Qanın tərkibini və xüsusiyyətini öyrənən elm sahəsi.

**HEMOQLOBİN** [*yun.* haima – qan və *lat.* globus – kürəcik] Qana qırmızılıq verən maddə (qan kürəciklərinin əsas tərkib hissəsi olub, orqanizmdə oksigeni və karbonu toxumalara yayıcı vəzifəsini görür).

**HEPATİT** *is.* [*yun.*] *tib.* Qara ciyərin iltihabı.

**HERBÁRİ** [*lat.* herbarius – bitkiyə aid] Qurudulmuş bitki kolleksiyası.

**HERİK** *is. k.t.* Payızda şumlanıb dincə qoyulma. *Qarğıdalıdan sonra əkilmiş buğdanın dəni herik edilmiş zəmidə yetişdirilən buğdanın dənindən ağır olur.* ◻ **Herik şumu** *k.t.* – payız şumu.

**HERMAFRODİT** *is.* [*yun.*] Kişi və qadın əlamətləri olan insan və ya heyvan.

**HERÓQLİF** [*yun.*] İdeoqrafik yazı sistemində heca və ya səs bildirən fiqurlu işarə. *Heroqlif yazısı. Heroqliflər müxtəlif sayda qrafik ünsürdən təşkil olunur.*

**HERS** [*xüs. is.*-dən] *fiz.* Rəqs tezliyinin ölçü vahidi.

**HERSÓQ** [*alm.*] Qərbi Avropada yüksək zadəgan, knyaz titulu. // Belə titulu olan adam. // Orta əsrlərdə iri feodal.

**HERSOQLUQ** *is.* 1. Başında hersoq duran feodal dövləti.

2. Hersoq titulu.

**HESAB** *is.* [*ər.*] 1. Hər hansı hesablamanın rəqəmlərlə ifadə olunan nəticəsi; say, miqdar. *Əgərçi bizim qoşunumuz da hesab və ədəddə taifeyi-Osmaniyyədən kəm deyildi..* M.F.Axundzadə. *Qulaq asanların hesabı artdı.* Ə.Haqverdiyev. ◻ **Hesab etmək (eləmək)** – saymaq, hesablamaq. *Fabrikin gəlirini hesab etmək. Gəlir və çıxarını hesab etmək. – Xozeyin dinməz-söyləməz çötkəni götürüb, çaq-çuq hesab elədi.* S.M.Qənizadə. *Leylək qızılın hamısını hesab etməkdə çox çətinlik çəkdi.* S.Rəhimov. // Hesablama, sayma, hesab etmə. *Bir sıra alimlərin apardığı hesaba görə Yer kürəsinin tərkibində olan tək uran və torinin atom enerjisi neft və daş kömür ehtiyatının enerjisindən 20 dəfə çoxdur.* A.Qarayev.

2. Riyaziyyatın, rəqəmlərin sadə xüsusiyyətlərini və onlarla həll olunan əməliyyatı öyrənən bəhsi. *Hesab dərsi. Hesabdan “5” almaq. – Lalə yalnız Şirmayının məktəb işlərinə qarışardı, vaxtı olanda dərslərini xəbər alar, hesab məsələlərinin həllinə kömək edirdi.* M.Hüseyn.

3. Borc, verəcək. [Hafizə xanım:] *Rəhim kişi, hesabın hamısını gətiribsənmi?* Ə.Haqverdiyev.

4. *müh.* Maliyyə əməliyyatı və ya hər hansı idarənin, müəssisənin maliyyə əməliyyatının mühasibat uçotu üçün əsas olan sənədlər. *İdarənin hesab nömrəsi.*

5. **Hesabla** şəklində *zərf* – ehtimal ki, güman ki, ola bilər ki. *Hesabla bu gün gəlməlidir. – Hesabla* [Tapdıq] *hospitalda bir az da yatmalı idi.* Ə.Əbülhəsən.

6. **Hesabına** şəklində *zərf* – vəsaiti ilə, pulu ilə. *Öz hesabına ezamiyyətə getmək. Fikirləşir bir qədər; Bu gün hara gedəcək; Yaxud kimin hesabına; Harda nahar edəcək?* Z.Xəlil.

◊ **Hesab aparmaq** – nəticə çıxarmaq, başa düşmək. *Hər kəs öz hesabını aparsın.* **Hesab çəkmək** – 1) haqq-hesab etmək, gəliri və xərci hesablamaq; hesablaşmaq. [Mozalanbəy:] *Bala seyidi çağırıb hesab çəkdim.* Ə.Haqverdiyev. *Hacı Nəsir ayrı bir şəhərdə yaşayan şərikilə hesab çəkməyə getmişdi.* S.S.Axundov; 2) sayğacda hesablamaq, çötkəyə vurmaq. *Qorxmaz içəri girəndə Saleh stolun dalında oturub hesab çəkirdi.* Ə.Vəliyev. **Hesab etmək (eləmək)** *məc.* – 1) fikirləşmək, təsəvvür etmək, təsəvvürünə gətirmək, güman etmək, zənn etmək. [Xortdan:] *Bir də mən belə hesab edirdim ki, cəhənnəm bir böyük şəhərdir.* Ə.Haqverdiyev. *Şəfiqə əvvəl elə hesab elədi ki, yenə gələn Lütfəlidir.* İ.Musabəyov; 2) saymaq, bilmək. [Əhməd:] *İndi ki, bizi oğru hesab eləyirsiniz, qapınızı qıfıllayın..* N.Vəzirov. *İndiyə kimi Bəhramı bakılı hesab edən müəllim tamamilə çaşdı.* Ə.Vəliyev. **Hesab olunmaq** – sayılmaq, bilinmək. [Yaşlı kişi:] *Məhəlləmizin ruhanisi Molla Hüseyn, axundun ən sadiq bir müridi hesab olunar, cənnət və cəhənnəm haqqında təlqinatına ürəklə inanardım.* S.Hüseyn. **Hesaba almadan** – fikir vermədən, saymadan, saygı göstərmədən. *Armudboğaz oğlan bərbəzəkli xanım müştəriləri hesaba almadan daha yağlı müştəri saydığı "generalla" əyləndi.* S.Rəhimov. [Muxtar:] *Danışacağam, ancaq kimin xoşuna, ya bədinə gəldiyini hesaba almadan danışacağam.* Mir Cəlal. **Hesaba almaq** – nəzərdən qaçırmamaq, nəzərə almaq, hesablamaq. *Kollektivin rəyini hesaba almaq lazımdır.* **Hesaba almamaq** – saymamaq, fikir verməmək, nəzərə almamaq, vecinə almamaq. *Zərrintac xanım kol ətəyindən gələn əsil-nəsəbsiz Ələmdarı heç adam cərgəsinə qoyub, onun var-yoxluğunu belə hesaba almırdı.* S.Rəhimov. *Hesaba almazdın mənimtək sən də; Özgə danlağını, yad tənəsini.* B.Vahabzadə. **Hesaba vurmaq** – hesablamaq, haqq-hesab etmək. *Biz hesaba vurduq, gəlib oktyabr ayının sonu çıxdı.* S.S.Axundov. **Hesabı açmaq** – futbol, voleybol, güləşmə və b. idman yarışlarında birinci xalı qazanmaq. *İlk dəqiqədə* [hücumçu] *rəqiblərin qapısından bir top keçirərək, hesabı açmağa müvəffəq olmuşdur.* **Hesabı çürütmək** – 1) çatası pulu tamamilə verərək və ya alaraq haqq-hesabı qurtarmaq, hesablaşmaq; 2) mübahisəli, davalı məsələni həll etmək. [Nəbi:] *Hesabı çürüdək, bu son görüşdür.* S.Rüstəm. **Hesabı düz çıxmamaq** – arzusu, istəyi həyata keçməmək, istədiyi olmamaq, təxmini düz çıxmamaq. **Hesabı itirmək** – hesablayarkən, sayarkən səhv etmək; miqdarını, sayını yaddan çıxarmaq, hesabı dolaşdırmaq. *Yazı-pozu bilməyən Leylək beşliyi, onluğu, bir də yeddi manat yarımlığı dolaşıq salıb hesabı itirməkdən qorxdu.* S.Rəhimov. **Hesabı var** – çoxluq, saysızlıq bildirir. [Xırdaxanım:] *Qumun, torpağın sayı var, hesabı var, mənim dərdimin hesabı yoxdur.* N.Vəzirov. **Hesabı yoxdur** – b a x **hesabı var**. *Ovçu əlində oxdur; Oxun hesabı yoxdur; Dost çox olsa nə eybi; Bir düşmən yenə çoxdur.* (Bayatı). **Hesabıma (hesabına) görə** – məncə (səncə), mənə (sənə) görə, mənim (sənin) fikrimcə (fikrincə). *Rüstəm kişinin hesabına görə, bu il yaz da mülayim və yağıntılı olmalı idi.* M.İbrahimov. **Hesabına getmək** – hesablamaq, saymaq, miqdarını müəyyənləşdirmək. [Muzdur] *axır bir nəfəsini dərib pulun hesabına getməyə başladı.* S.M.Qənizadə. **Hesabını aparmaq** – başa düşmək, duymaq, nəticə çıxarmaq. *Molla Tanrıverdinin rəngi üzündən qaçıb ağappaq gəc kimi ağardı, həmin saat hesabını apardı.* E.Sultanov. **Hesabını başa düşmək** – b a x **hesabını aparmaq**. [Vahid:] ..[Anam] *məni yanakı süzəndə hesabımı başa*

*düşərdim.* B.Bayramov. **Hesabını çəkmək** – hesablamaq, hesab etmək, saymaq. [Kibernetika maşınları] *Çəkir hesabını da; Minlərin, milyonların.* B.Vahabzadə.

**HESABAALMA** *is.* Hesablama, siyahıyaalma yolu ilə bir şeyin miqdarını, sayını, ədədini müəyyənləşdirmə. *Malları hesabaalma. Hesabaalma vərəqəsi.*

**HESABAGƏLMƏZ** *sif.* Hesablanması, sayılması mümkün olmayan; saysız-hesabsız, hesaba gəlməyən.

**HESABAGƏLMƏZLİK** *is.* Sayı-hesabı olmama; saysızlıq, hədsizlik.

**HESABAT** *is.* [*ər.* "hesab" söz. cəmi] 1. Öz işi, verilən tapşırığı yerinə yetirməsi, yaxud apardığı tədqiqatın nəticəsi və s. haqqında məsul şəxsə, ya kollektivə, təşkilata və s. verilən yazılı və ya şifahi rəsmi məlumat. *İllik hesabat. Şöbənin hesabatı. – Maral qonaqları yola saldıqdan sonra komissarlığa getmiş, .. göndərilən hesabatla tanış olmaq üçün iki saata qədər orada oturmuşdu.* Ə.Əbülhəsən.

2. Bir şey və ya iş haqqında izahat, geniş məlumat. [Muxtar Firəngizə:] *Elə bilirəm ki, kişinin arvada hesabat verməsi məcburi deyildir.* B.Bayramov. // *müh.* Buraxılmış pulun xərclənməsi haqqında sənəd. *Maliyyə hesabatı. Təhtəlhesab pulun hesabatı.*

**HESABCIL** *sif.* Hər şeyin hesabına gedən, hesablamağı yaxşı bacaran, hesabını bilən. *Hesabcıl adam.*

**HESABDAR** *is.* [*ər.* hesab və *fars.* ...dar] Hesabdarlıq işçisi, mütəxəssisi. [Fərhad] *bir il, iki il hesabdar, ferma müdiri, mühasib olmuşdu.* M.İbrahimov. *Qələndərov əvvəllər Xaçbulaqda qoyunçuluq fermasında hesabdar idi.* Mir Cəlal. // *köhn.* Mühasib. [Qədir] *hesabdara da söylədi ki,* [Nəsirə] *ayda qırx manat hesabı ilə maaş yazsın.* S.Hüseyn. *..Orada mənim maaşımın ayda on tümən artırılması üçün hesabdara əmr verilmişdi..* M.S.Ordubadi.

**HESABDARLIQ** *is.* 1. Hesablar üzrə əməliyyat uçotu aparılması; mühasibat (buxalteriya) uçotu.

2. Hesabdar vəzifəsi. *Yarməmməd çoxdan hesabdarlıqdan bir pillə yuxarı qalxmaq fikrində idi.* M.İbrahimov. *Əşrəf gördü ki, hesabdarlıq Nazlının çox xoşuna gəlir.* S.Rəhman.

**HESABİ** *sif.* və *zərf* [*ər.*] *dan.* Düz, doğru, haqlı. *Hesabi tələb.* – [Teymur ağa:] *Bu hesabi sözdür, amma yalqız bu ehtimal ilə xatircəm olmaq olmaz.* M.F.Axundzadə.

**HESABLAMA** "Hesablamaq"dan *f.is. Hesablama işləri. Hesablamanın nəticəsi.* // *Sif. mənasında.* Hesablamaq üçün olan hesablayıcı. *Hesablama maşınları.*

**HESABLAMAQ** *f.* 1. Hesablama işi aparmaq, sayıb yekunlaşdırmaq. *Xərclədiyi pulu hesablamaq. Əməkgünlərini hesablamaq. – Balaca Sabir barmağı ilə hesablayıb yazırdı.* S.Rəhimov. [Fərman] *qabağına bir kağız qoyaraq, karandaşla bir çox rəqəm yazır və hesablayırdı.* Ə.Sadıq.

2. Hesablama zamanı müəyyən ölçü vahidindən və ya hər hansı bir cihazın göstərdiyi sistemdən istifadə etmək. *Temperaturu Selsi ilə hesablamaq.* // Texniki hesablama aparmaq. *Binanın uzunluğunu hesablamaq. Otağın sahəsini hesablamaq.*

**HESABLANMA** "Hesablanmaq"dan *f.is.*

**HESABLANMAQ** "Hesablanmaq"dan *məch. Layihənin xərci hesablandı. – Ulduzların həyatı milyard illərlə hesablanır..* "Günəşin tarixi".

**HESABLAŞMA** "Hesablaşmaq"dan *f.is.*

**HESABLAŞMAQ** *qarş.* 1. Çatası, çatmalı pulu tamamilə verərək və ya alaraq haqqhesabı qurtarmaq. – *Bahadır ev yiyəsi ilə hesablaşıb, şeylərini gədəyə tapşırdı və özü də Sonagilə getdi.* N.Nərimanov.

2. *məc.* Qisas almaq, əvəzini çıxmaq. [Dəli Alı:] *Sizi soyanlardan bircəciyinin nişanını yadınızda saxlayın, mənə deyin. Onları tapıb, özüm hesablaşaram.* "Aşıq Ələsgər".

3. *məc.* Saymaq, saya salmaq, saygı göstərmək, nəzərə almaq. *Adamla hesablaşmaq lazımdır. O heç kəslə hesablaşmır. –* [Atam:] *Köhnələrin də rəyi ilə bir az hesablaşmalıdır.* Çəmənzəminli. [Zeynal] *istəyirdi ki, hər kəs onunla hesablaşsın.* S.Hüseyn.

**HESABLAYICI** *is.* 1. Bir şeyi hesablamaqla, saymaqla, sayını müəyyən etməklə məşğul olan şəxs; sayıcı. *Hesablayıcıların təlimat müşavirəsi. – Şahpəri hesablayıcının otağına girəndə mat qaldı.* B.Bayramov.

2. Sərf olunan elektriki, suyu, qazı və s. hesablamaq üçün cihaz. *Elektrik enerjisi hesablayıcısı. Hesablayıcını yoxlamaq. – Lövhəli su hesablayıcıları şar formasında olan ölçü kamerindən ibarətdir.* "Nəzarət-ölçü cihazları". // Sif. mənasında. *Hesablayıcı komissiya. Hesablayıcı maşın. Boru ilə axan qazın miqdarını hesablayıcı cihaz ölçür.*

**HESABSIZ** *sif.* Həddən artıq, çox, sayı-hesabı olmayan. *Dəhşətli, qüvvətli, hesabsız ləşkər; Şimaldan düz şərqə yürüş edirlər.* A.Səhhət. *Uşaq gözünü açıb ətrafındakıları gördükdə onları bilmək istəyir, odur ki, hədsiz və hesabsız suallar verir.* Çəmənzəminli.

**HETEROGÉN** *sif.* [*yun.*] Eyni cinsdən olmayan, müxtəlif tərkibli hissələrdən ibarət olan. *Heterogen reaktor.*

**HEY**[1] *is.* Qüvvət, iqtidar, cismani enerji. *Canında hey yoxdur.*

◊ **Heydən düşmək (kəsilmək)** – gücdən düşmək, üzülmək, əldən düşmək. *Səttarla Ülkər bir böyük meşə ilə yeddi gün, yeddi gecə yol gedib, bir böyük dağa çıxdılar. Onların çörəkləri qurtardı, heydən kəsildilər.* (Nağıl). [Ataşın] *əngləri heydən düşür, dili çətinlikdə hərlənirdi.* Ə.Vəliyev. **Heyi qalmamaq (kəsilmək)** – bax **heydən düşmək (kəsilmək)**. [Odunçuoğlu] *çox gedə bilmədi, ayaqlarının heyi kəsilib, yol kənarında bir təpə üstündə oturdu.* Ə.Məmmədxanlı.

**HEY**[2] Çağırış və ya müraciət bildirən nida – ey, ay. [İskəndər:] *Hey Zeynəb, vallah, fəndini duymuşam... Qonağın yolunda bu qədər çalışırsan ki, ərin Kərbəlayı Novruzu da diriltsin?* C.Məmmədquluzadə. *Rüstəm səsi dolusu*: *– Ay Qəhrəman, hey! – deyə oğlunu çağırırdı.* S.Rəhimov.

**HEY**[3] *əd.* Bir şeyin daim, arasıkəsilmədən və ya tez-tez təkrarlandığını və ya çox davam etdiyini bildirir. *Yağış hey yağır. Uşaq hey ağlayır. Hey xəstələnmək. Hey donquldanmaq. – Həcər baxdıqca bu səmtlərə hey baxdı.* S.Rəhimov. *Qaranlıqda it zingildədi, Qoşatxan bildi ki, hey hürərək əl çəkmək istəməyən iti ev yiyəsi vurdu.* M.İbrahimov.

**HEYBƏ** *is.* Çiyindən, bəzən də atın tərkindən aşırılan kiçik xurcun. *Tahir xalı kimi rəngbərəng iplərdən toxunmuş balaca dolu heybəsini çiyninə aldı..* M.Hüseyn. *Yalıncaq ax-ufla heybəsini açıb oradan .. bir ipək köynək çıxardı.* M.Rzaquluzadə.

**HEYBƏCİK** *is.* Kiçik heybə. *Heybəciyi çiyninə salmaq.*

**HEYBƏT** *is.* [*ər.*] Qorxu və eyni zamanda hörmət hissi oyandıran hal, görkəm. *Çalışqan, namuslu Ayrım qızının üzündə kişilərə məxsus bir heybət vardı.* A.Şaiq. // Zəhm, vahimə, dəhşət. *Oğlanın heybətindən hərə bir tərəfə dağıldı.* (Nağıl). *Heybətindən lərzə düşər canıma; Sanasan, quluna padişah baxar.* M.P.Vaqif.

**HEYBƏTLİ** *sif.* Heybət doğuran, hörmət hissi ilə bərabər qorxu hissi doğuran; zəhmli. *Heybətli görkəm. Heybətli baxış. Əlyarov dişini qıcayıb* [Ərknazın] *üzünə daha heybətli bir nəzər saldı.* M.Hüseyn. [Şamxalın] *nəzərində kişi* [Cahandar ağa] *getdikcə böyüdü və nərildəyərək ov üstünə atılmağa hazırlaşan heybətli bir pələngə döndü.* İ.Şıxlı.

**HEYƏT** *is.* [*ər.*] 1. Hər hansı bir təşkilatın, kollektivin tərkibini təşkil edən adamlar toplusu; tərkib. *Redaksiya heyəti. Komissiyanın heyətində dəyişiklik.* – [Çingiz gənclərə:] *Müsamirə düzəltmək üçün ayrıca bir heyət seçməlidir.* Çəmənzəminli.

2. Xidmətinə, ixtisasına və s. görə bir qrup təşkil edən adamlar. *Rəhbərlik edən heyət* (rəhbərlər). *Komanda heyəti* (komandirlər). *Müəllim heyəti* (müəllimlər). – [Sədr:] *Məhkəmə heyəti müttəhim Baxışın da qiyamçılar hərəkatı ilə əlaqəsi olduğunu təsdiq edir.* C.Cabbarlı.

3. *klas.* Görkəm, görünüş, şəkil, surət, qiyafət. *Xubani-hərəm* [hökmdarı] *bu heyətdə görəndə az qaldılar qəhqəhə etsinlər.* M.F.Axundzadə. [Münəvvər:] *Ana, mənim təqsirim nədir ki, bu libaslar ilə məni insanlıq heyətindən çıxartdın?* M.S.Ordubadi.

**HEYİF** *əd.* [*ər.*] bax **təəssüf**. *Əfsus, qocaldım, ağacım düşdü əlimdən; Səd heyif cavanlıq!* M.Ə.Sabir. *Heyif, çiçəklərin ömrü az olur; Sənə çatanacan bəlkə solacaq.* O.Sarıvəlli.

◊ **Heyfi gəlmək** – 1) bir şeyi xərcləmək, işlətmək, vermək istəməmək, əsirgəmək. *Bardaqdakı sərin suya Səməndərin heyfi*

*gəlirdi.* B.Bayramov; 2) yazığı gəlmək. [Mirzə Sadıq:] *Həqiqətən* [Fərhada] *çox heyfim gəlir.* C.Cabbarlı.

**HEYİFLƏNMƏ** "Heyiflənmək"dən *f.is.*

**HEYİFLƏNMƏK** b a x **heyifsilənmək**. *Mən həmişə heyiflənərdim ki, təhsil etməmişəm.* C.Məmmədquluzadə.

**HEYİFSİLƏNMƏ** "Heyifsilənmək"dən *f.is.*

**HEYİFSİLƏNMƏK** 1. B a x **təəssüflənmək**. *Amma mən ona heyifsilənirəm ki, bu sözlər ərəbcə yazılıb və camaat qanmayacaq.* C.Məmmədquluzadə. *Xan Dızaq sığnağına atlı göndərdiyini söylədi, Vaqif heyifsilənən* (f.sif.) *kimi oldu.* Çəmənzəminli.

2. *f.* Heyfi gəlmək, əsirgəmək (əsasən inkarda işlədilir). [Mürsəl:] *Canavar ovuna gedən gülləyə heyifsilənməməlidir.* Ə.Vəliyev.

**HEYHAT** *nida* [*ər.*] Əfsus, təəssüf, heyif. *Şeirsiz, nəğməsiz gəzib bir ara; Heyhat, oynamamış könlüm yerindən.* M.Müşfiq. *Milçək o mənzilə çatarmı, heyhat; Ki, simurğ orada salmışdı qanad!* Şəhriyar.

**HEYKƏL** *is.* [*ər.*] 1. Heykəltəraş tərəfindən daşdan, tuncdan və s.-dən hazırlanmış insan və ya heyvan surəti. *Mərmər heykəl. Füzulinin heykəli. – Yaşıl məhəccərli dördkünc bağçada Nizaminin tuncdan tökülmüş miniatür heykəli qoyulmuşdu.* M.Hüseyn.

2. *is.* Cindən, həmzaddan və bədnəzərdən qorumaq üçün uşaqların boynuna asılan dualı, muncuqlu asqı. b a x **medalyon**. *Sağdan sola, soldan sağa sal boynuna heykəl; Qoy cinni məəttəl..* M.Ə.Sabir.

3. *məc.* b a x **mücəssəmə** 2-ci mənada.

◊ **Heykəl kimi** – müqəvva kimi, hərəkətsiz. *Mübaşir Məmməd, heykəl kimi hərəkətsiz durmuş qıza, onun şümşad boyuna nəzər saldı..* M.İbrahimov. *..Donuq nəzərlə* [Səməd] *heykəl kimi quruyub qalmış gəlinin üzünə baxa-baxa qaldı.* İ.Hüseynov.

**HEYKƏLTƏRAŞ** *is.* [*ər.* heykəl və *fars.* ...təraş] Heykəltəraşlıq əsərləri yaradan sənətkar. *Azərbaycan heykəltəraşları monumental abidələr yaratmışlar.*

**HEYKƏLTƏRAŞLIQ** *is.* 1. Təsviri sənətin qazıma, yonma, kəsmə, yapma və ya tökmə üsulu ilə həcmli təsvirlər (heykəl, büst, barelyef və s.) yaradan növü. *Klassika dövrü yunan heykəltəraşlığı dünya incəsənətinin ən maraqlı hadisələrindən biridir. – Biz eyni sözləri musiqi haqqında da, rəssamlıq və heykəltəraşlıq, memarlıq haqqında da deyə bilərik.* İ.Əfəndiyev.

2. Daşdan, tuncdan və b. materiallardan düzəldilmiş belə sənət əsəri. *Müsabiqəyə .. heykəltəraşlıq əsərləri də təqdim edilmişdir.* // Belə əsərlərin toplusu. *Azərbaycan heykəltəraşlığı.*

**HEYRAN** *is.* [*ər.*] Gözəl və ya əzəmətli bir şey qarşısında vurulmuşcasına çaşıb qalma; valeh olma. [Nigar xanım:] *Eyvazım bənzər laçına; Sonalar heyran saçına.* "Koroğlu". □ **Heyran etmək (buraxmaq)** – valeh etmək, məftun etmək, heyrət içində buraxmaq. *Oğlanın cəsarəti, bu yad yerdə qorxmaması onu* [Zərnigarı] *heyran etmişdi.* İ.Şıxlı. **Heyran qalmaq (olmaq)** – valeh olmaq, məftun olmaq; bir şey qarşısında vurulmuşcasına çaşıb qalmaq. *Nə gözəldir, nə qəribə, səfalı; Heyran olur adam görcək bu halı.* A.Səhhət. *Həm də gözəl ney çalır, o qalır yana-yana; Eşidən heyran qalır onun mahnılarına.* B.Vahabzadə.

**HEYRANEDİCİ** *sif.* Valehedici, məftunedici; ecazkar. *Heyranedici mənzərə. Heyranedici musiqi. – ..Böyük sənətkarların qəlbini həyəcanla döyündürmüş ecazkar el ədəbiyyatının heyranedici sirrini hiss edirsən.* İ.Əfəndiyev.

**HEYRANLIQ** 1. *is.* Gözəl və ya əzəmətli bir şey qarşısında vurğuncasına valehlik. [Afşinin] *Babəkə zillənmiş baxışlarında heyranlıq və çaşqınlıq bir-birini əvəz edirdi.* Ə.Məmmədxanlı.

2. **Heyranlıqla** şəklində *zərf* – heyran-heyran, vurğuncasına, valehcəsinə. *Mən arzularımın hovuzu kənarında durub məqsədimin surətini dərin bir heyranlıqla müşahidə edirəm.* M.Müşfiq.

**HEYRATI** *is.* [*Herat şəhərinin adından*] Şərq muğamlarından birinin adı. *Heyratı oxumaq. – Bir pərdə Çahargah, bir sim Heyratı; Bir ağız Dilqəmi gətirin mənə.* M.Araz. □ **Heyratı xoruz** – iri, döyüşkən xoruz növü. **Heyratı kəlağayı** – iri, güllü kəlağayı. *Heyratı ipək kəlağay; Örtüb qəddi-dala gözəl.* Aşıq Ələsgər.

**HEYRƏT** 1. *is.* Qeyri-adi, gözlənilməz, qəribə, anlaşılmaz bir şeydən, hadisədən çaşqınlıq halı; təəccüb. *Usta Murtuz heyrətindən qayıdıb aşağı baxdı.* Mir Cəlal. [Oğlan] *yəqin mənim üzümdə heyrət əlaməti görüb əlavə etdi.* M.Rzaquluzadə. ☐ **Heyrət almaq (götürmək, aparmaq)** – çaşıbqalmaq, heyrət etmək. [Qoşunəli:] *Baba, necə fikir dəryasında üzməyim, məni heyrət aparıbdır..* Ə.Haqverdiyev. *Kərəmi heyrət alır; Kərəm xəyala dalır.* S.Vurğun. **Heyrət etmək** – təəccüblənmək, heyrətlənmək, təəccüb etmək. [Qadın Xəlilə:] *Siz belə ailə dostu olduğunuz halda indiyə qədər subay qaldığınıza heyrət edirəm..* Çəmənzəminli. **Heyrət içində (içərisində)** – təəccüblənmiş halda, təəccüb içərisində, təəccüblənərək. *Qızılgül kimidir isti yanaqlar; Heyrət içindədir gələn qonaqlar..* S.Vurğun. *Ətrafa baxdıqca* [Aydının] *qara gözləri heyrət içərisində yanırdı.* H.Seyidbəyli. **Heyrətdə qoymaq** – 1) bax **heyrətə salmaq**; 2) valeh etmək, heyran etmək. *Heyrətdə qoyur səni; Çılpaq qadın vücudunun kamil cizgiləri.* R.Rza. **Heyrətə gəlmək (düşmək, dalmaq)** – bax **heyrət etmək**. *Bu iki həmşəhərlilər bir-birinə rast gəldikdə heyrətə dalıb qaldılar.* Çəmənzəminli. *Heyrətə düşmüş* (f.sif.) *bağban, saçları çiyinlərindən üzüaşağı tökülən Həcəri gördü və heyrətlə süstləşib dayandı.* S.Rəhimov. **Heyrətə salmaq (gətirmək)** – təəccübləndirmək, heyrətləndirmək, təəccübə salmaq. *Oxu! Qüvvət gəlsin şerə, sənətə; Könlümün quşunu gətir heyrətə.* M.Müşfiq.

2. **Heyrətlə** şəklində *zərf* – təəccüblə, heyrət edərək, heyranlıqla. *Əlisəfa gözlərini heyrətlə döyməyə başladı.* S.Hüseyn. [Kərimov] *heyrətlə Məmmədova baxdı.* H.Seyidbəyli.

**HEYRƏTAMİZ** *sif.* [*ər.* heyrət və *fars.* ....amiz] Heyrət doğuran, qəribə, heyrətə salan, təəccüblə, gözlənilməz, heyrətəngiz. *Heyrətamiz mənzərə. – Dünya hadisələri heyrətamiz bir sürətlə inkişaf edir, insanları hər gün yeni bir vaqiə qarşısında buraxırdı.* M.İbrahimov.

**HEYRƏTƏNGİZ** [*ər.* heyrət və fars. ...əngiz] bax **heyrətamiz**. *Nigar heyrətəngiz bir sima ilə baxdı, düşündü və böyük qardaşına fikrini açıq söyləməyə cəsarət eləmədi.* Çəmənzəminli.

**HEYRƏTLƏNDİRMƏ** "Heyrətləndirmək"dən *f.is.*

**HEYRƏTLƏNDİRMƏK** *f.* Heyrət doğurmaq, heyrətə salmaq, təəccübləndirmək. [Abışın] *səsi Qədiri daha da heyrətləndirirdi.* Mir Cəlal. *Cavan leytenantın gözlərindəki mətinlik, gizli ehtiras və odlu yalvarış onu heyrətləndirirdi.* H.Seyidbəyli.

**HEYRƏTLƏNMƏ** "Heyrətlənmək"dən *f.is.*

**HEYRƏTLƏNMƏK** *f.* Heyrət etmək, təəccüblənmək, təəccüb etmək. *Kazım fəqət xəbərsizdi bu işdən; Gəldi, gördü, heyrətləndi bir qədər.* M.Müşfiq. *Mənsə heyrətləndim, sözün doğrusu; Dedim, nə olmuşdur? Nə danışır bu?* S.Vurğun. *Bu heyrətlər donuqları heyrətləndirər; Bu daşların görünməmiş vulkanı başlar.* M.Araz.

**HEYRƏTLİ** *sif.* Heyrət doğuran, gözlənilməz, qəribə, heyrətə salan; təəccüblü, heyrətamiz, heyrətəngiz. [Dərviş] *heyrətli və kəskin bir nəzərlə baxınıb durur.* H.Cavid.

**HEYSİYYƏT** *is.* [*ər.*] Mənlik, şan, şərəf, qürur; mənlik hissi. *Eşqin atəşində o yandırmadı; Böyük mənliyini, heysiyyətini.* B.Vahabzadə.

**HEYSİYYƏTLİ** *sif.* Heysiyyəti, mənliyi olan; mənliyini qoruyub saxlayan, şərəfli. [Qızı Turxan bəyə:] *Atadan-babadan sizin namuslu, heysiyyətli bir xanədan olduğunuzu bütün vilayət bilir.* H.Cavid.

**HEYSİYYƏTSİZ** *sif.* Heysiyyəti, mənliyi olmayan; şərəfsiz, alçaq. [Fərman] *Mələyin .. heysiyyətsiz bir adam olduğunu düşündü.* M.İbrahimov.

**HEYSİZ** *sif.* Gücsüz, qüvvəsiz, taqətsiz, heyi olmayan. *Heysiz qoca.*

**HEYVA** *is.* Sarı rəngli, turşməzə, üstü tüklü, xırda çəyirdəkli meyvə. *Heyva mürəbbəsi.* – [Əyyar:] *Elə ki, budaqlar başını əyir; Nar, heyva, şaftalı, gavalı dəyər.* A.Şaiq. *Almalar qızarır, armudlar, heyvalar saralır, əzgillə zoğal bir-birinə qarışırdı.* S.Rəhimov. // Bu meyvənin ağacı. [Məmməd:] *Yatır tut ağacı, yatır xan çinar; Əyir budağını heyva, iydə, nar.* Z.Xəlil.

**HEYVAGÜLÜ** *is. mus*. Azərbaycan xalq oyun havalarından birinin adı. *Heyvagülü çalmaq.*

**HEYVAN** *is.* [*ər.*] 1. İnsanı çıxmaqla hər cür canlı məxluq. [Qaçay:] *Atalar deyib ki, heyvan iyləşə-iyləşə, insan dilləşə-dilləşə yaxınlaşar.* Ə.Vəliyev. // Bitkilərdən başqa hər cür canlı varlıq. *Vəhşi heyvan. Onurğasız heyvanlar.*

2. Əhliləşdirilmiş dördayaqlı canlı məxluq. *Ev heyvanları. Qoşqu heyvanları.* – [Qara Kərəmoğlu:] *Bir dəfə bazar ayağında bir dəstə adamın içində heyvanlardan söhbət düşür, biri deyir, camış yaxşı heyvandır, qatığı çox dadlı olur..* M.İbrahimov. *Camal kişi heyvanları rahat eləmək üçün tövləyə getdi.* Ə.Vəliyev.

3. Yabanı, vəhşi canlı məxluq. *Yırtıcı heyvanlar. Meşə heyvanı. Xəzlik heyvan.* – [Sitarə:] *Meşə qaranlıq, özüm tək, vəhşi heyvanlar...* C.Cabbarlı.

4. *məc.* Adətən yazıq, fağır, zavallı, aciz uşaq haqqında deyilir. [Məhəmmədağa:] *Uşaq sizindir, onun xeyrini siz görəcəksiniz, əbəs yerə heyvan uşağı bədbəxt eləməyiniz, qoyunuz gəlib oxusun.* N.Nərimanov.

5. *məc.* Qanmaz, anlamaz, kobud, yaxud ağılsız, dərrakəsiz adam haqqında. *Heyvanın biridir.* // Bəzən söyüş məqamında işlənir. [Məşədi İbad:] *Görünür ki, heyvan balası dəllək hənanı pis yaxıbdır.* Ü.Hacıbəyov.

**HEYVANAT** *is.* [*ər.* "heyvan" söz. cəmi] Heyvanlar, heyvanlar aləmi. [Fərhad:] *..Yer, göy titrəşsin, göyün quşları, yerin heyvanatı, dəryaların balıqları, hamısı gərək mənim üçün ağlaşalar.* Ə.Haqverdiyev. *Heyvanat qissəsidir dünya "Kəlilə-Dimnə"; Ta ki axırda bir az qovzanıb insan olacaq; Azı insan da olursa, çoxu heyvan olacaq.* Şəhriyar.

**HEYVANCASINA** *sif.* və *zərf* Heyvan kimi, vəhşicəsinə, kobudcasına.

**HEYVANCIĞAZ** 1. Bax **heyvancıq**.

2. *oxş.* Nəvazişlə balaca, körpə uşaq haqqında deyilir – yazıq uşaq, zavallı uşaq. *Heyvancığaz qızdırma içində yanır.*

3. *məc.* Qaba, kobud adam haqqında. *Tərpənməyə heyvancığazın taqəti yoxdur; Ehsansız olan məclisin heç ləzzəti yoxdur.* Ə.Vahid.

**HEYVANCIQ** *is.* Kiçik heyvan, balaca heyvan, yazıq heyvan, heyvancığaz. *Həsrətlərinə qovuşmuş heyvancıqlar ayaqlarını bükərək quyruqlarını oynada-oynada analarının məmələrini əmirdilər.* A.Şaiq.

**HEYVANDAR** *is.* [*ər.* heyvan və *fars.* ...dar] 1. Heyvandarlıq mütəxəssisi.

2. Mal-qara saxlamaqla, yetişdirməklə, maldarlıqla məşğul olan təsərrüfat, kəndli. *Gənc heyvandarların respublika toplanışı.* // Sif. mənasında. *Heyvandar təsərrüfatlar. Heyvandar kəndlilər.*

**HEYVANDARLIQ** *is.* Kənd təsərrüfatının ev heyvandarları, mal-qara saxlamaqla məşğul olan sahəsi. *Heyvandarlığı inkişaf etdirmək. Yoxsul kəndlinin təsərrüfat dərdləri – torpaq, su, becərmə, məhsuldarlıq, istehsal aləti, heyvandarlıq, ipəkçilik kimi məsələlərlə əlaqədar dərdlər "Əkinçi"nin başlıca mövzusu idi.* // Ev heyvanlarını saxlamaq və cinslərini yaxşılaşdırmaq haqqında elm. *Kənd təsərrüfatı institutunun heyvandarlıq fakültəsi. Heyvandarlıq haqqında mühazirə.*

**HEYVANXANA** *is.* [*ər.* heyvan və *fars.* ...xanə] Vəhşi heyvanların saxlandığı xüsusi yer, bina.

**HEYVANİ** *sif.* [*ər.*] 1. Heyvan ətindən, südündən, yağından və s.-dən hazırlanan, alınan; üzvi. *Heyvani maddələr. Heyvani məhsullardan ancaq süddə şəkər vardır.*

2. Heyvana (heyvanlara) xas olan; heyvana aid olan; qeyri-şüuri. *Heyvani həyat.* – [Məhbusi] *düşünürdü. Bir az iş gecikərsə bütün həyatı və taleyinin təhlükə altına düşəcəyi onu qorxudur, qəlbində heyvani bir vahimə oyadırdı.* M.İbrahimov. *Kamal* [qorxaqlığa] *çoxdan qalib gəlmiş, sonra bu ibtidai heyvani qorxaqlığa özü nə qədər gülmüşdü.* M.Rzaquluzadə. // *məc.* Şəhvani, cismani. *Heyvani hisslər.* – [Qətibə:] *Hüsaməddin anlamamışdır ki, mən heç kəsə satılmamışam. Lakin o bilmir ki, o özü bir qadının quru vədəsinə və özünün heyvani bir düşüncəsi xatirinə bir məmləkəti satmaq üzrədir.* M.S.Ordubadi.

**HEYVANLAŞMA** "Heyvanlaşmaq"dan *f.is.*

**HEYVANLAŞMAQ** *f.* İnsanlıq sifətlərini itirmək, vəhşiləşmək, kobudlaşmaq; sərtləşmək.

**HEYVANLIQ** *is.* Qanmazlıq, anlamazlıq, qanacaqsızlıq. *Heyvanlıq etmək.*

**HEYVANSİFƏT** *sif.* İnsan sifətlərini itirmiş; vəhşi, kobud, qanmaz, yontalanmamış.

**HEYVƏRƏ** *sif.* və *is.* 1. Kobud, qanmaz, ləyaqətsiz, tərbiyəsiz, ədəbsiz, zırrama, ağzıyava, ağzıpozuq. *Heyvərə adam. Heyvərənin biridir, dindirməsən yaxşıdır. – Qışqırdı bir qədər, zəhərdən acı; Qızışdı getdikcə heyvərə hacı.* H.K.Sanılı. // Bəzən söyüş kimi işlədilir. [İsmayıl bəy:] *Yalan danışma, heyvərə, mənim öz atlarım harada qalmışdı ki, səndən at istəyə idim.* N.Vəzirov.

2. Yekə, zorba, nataraz, yöndəmsiz. *Bozdar .. qocalmış, gözlərinə pərdə gəlmiş heyvərə bir köpəkdir.* S.S.Axundov. *Qamışın qalın bir yerində heyvərə bir çaqqal yerə sərilmişdi.* M.Rzaquluzadə.

3. *zərf* Avara-avara, boş-boş, avara-sərgərdan. *Dəxi ol sərvi-qədin kuyinə cənnət deyibən; Gəzmərəm küçələri heyvərə bundan sonra.* S.Ə.Şirvani.

**HEYVƏRƏLƏNMƏ** "Heyvərələnmək"-dən *f.is.*

**HEYVƏRƏLƏNMƏK** *f. dan.* Avara-avara gəzmək, avaralanmaq, veyillənmək. *Küçələrdə heyvərələnmək.*

**HEYVƏRƏLİK** *is.* 1. Qanmazlıq, kobudluq, tərbiyəsizlik, zırramalıq; sözünü, hərəkətini bilməmə; boşboğazlıq. *Bir bölük boşboğazıq, heyvərəlik adətimiz; Doludur lənət ilə, qeybət ilə söhbətimiz.* M.Ə.Sabir. [Sədr] *bunun səbəbini Canının heyvərəliyində, boşboğazlığında görürdü.* Ə.Əbülhəsən.

2. Avaralıq, veyillik; heç bir işlə məşğul olmama. *Heyvərəlik etmək.*

**HƏ** (bəzən "ə" saiti uzadılaraq tələffüz olunur) *əd.* 1. Verilən suala müsbət cavab və ya təsdiq məqamında işlənir (*yox* ziddi); bəli, elədir. *Hə, razıyam. – İmtahan verdinmi? – Hə, verdim. – Yemək istəyirsənmi? – Hə.* – [Vəli:] *Sultan bəyin evi buradır?* [Telli:] *Hə, buradır, nə işin var?* Ü.Hacıbəyov.

2. Sual cümlələrində sualı gücləndirir və təkid bildirir. *Hə, de görüm məndən nə istəyirsən? – Telli arvad yerindən dilləndi: – Ay imanı yanmış, gorda da məndən əl çəkməyəcəksən, hə?* M.İbrahimov. // Sual cümlələrinin axırında müsahibi cavab verməyə vadar etmək məqamında işlənir – düz deyil? elə deyilmi? de görüm mənasında. – *Siz haqlı olmadığınızı etiraf edirsinizmi? – Hə? – Bir də belə işlər edəcəksənmi? – Hə? – Birdən müəllimin gözü Tapdığın əlindəki ağ dəftərə sataşdı: – Bunu haradan almısan? Şəkil çəkirsən? Hə?* Ə.Vəliyev. // Nitqin daxilində əvvəlcə deyilmiş sözü israrla təsdiq məqamında işlənir və bəzən təkrar deyilir – düzdür, tamamilə doğrudur, elədir ki var, əlbəttə mənasında. – *Sən dediyinin üstündə durursanmı? – Hə, hə, dururam.*

3. Yaddan çıxmış bir şey birdən yada düşdükdə və ya başqa mətləbə keçdikdə deyilir – yeri gəlmişkən, bir də mənasında. *Hə, yaxşı yadıma düşdü. Hə, az qala yadımdan çıxmışdı, gələndə kitabını da gətir.*

4. Cümlənin əvvəlində müraciət zamanı işlənir – ey, ay mənasında. [İskəndər oxuya-oxuya daxil olur] – *Hə... ana, kefin necədir?* C.Məmmədquluzadə. *Qurban əlilə boynunu ovuşdura-ovuşdura: – Hə molla! Yaz ki, Qurbanın uşaqlarının anasına yetişəcək.* A.Şaiq. // Müraciətə, çağırışa cavab kimi işlənir – nə, nədir, eşidirəm! mənasında. – *Həsən? – Hə.*

**HƏB** *is.* [*ər.*] Toz dərmandan hazırlanmış kürəcik. *Həb atmaq. Acı həb. – Həkim bir neçə həb, beş də iynə dərmanı verdi.* Ə.Vəliyev. ◻ **Yastı həb** – dairə şəklində həb; tablet.

**HƏBƏŞ** *is.* Efiopiyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adamın keçmiş adı; efiopiyalı. *Zavallı, silahsız və kimsəsiz həbəşlərin boynunda faşist cəlladı öz qılıncının kəsərini yoxlayırdı.* M.İbrahimov. *Dünyanı gəz, dolaş; Həbəşi, zəncini dindir.* R.Rza.

**HƏBİB** *is.* [*ər.*] *klas.* Sevgili, dost. *Tutaram yarın qiyamətdə, həbibim, damənin.* Füzuli. [Bəhram:] *Mənim vicdanım ləkəlidir. Mənim həbibim!* C.Cabbarlı.

**HƏBS** *is.* [*ər.*] 1. Dustağasalma (salınma), azadlıqdan məhrumetmə (edilmə). *Həbs cəzası. – Məhbəs də, qəfəs də, həbs də, qəsd də; İnsan mərd olanda həddini aşmır.* M.Araz. ◻ **Həbs edilmək, həbsə düşmək** – həbsxanaya salınmaq, azadlıqdan məhrum

edilmək, dustağa düşmək. [Əmiraslan oğruluq və yol kəsmək üstündə] *neçə dəfə həbsə düşüb çıxdı.* S.S.Axundov. *Özü deməmişdi, bilirdim onu; Neçə il qabaq; Həbs eyləmişlər.* B.Vahabzadə. **Həbs etmək, həbsə almaq** – həbsxanaya salmaq, azadlıqdan məhrum etmək. [Kərəm Hələb paşasına:] *İndi, buyur, məni aparsınlar, həbs etsinlər.* Ü.Hacıbəyov.

2. *hüq.* Mülkdən, maldan və s.-dən istifadə edilməsinin məhkəmə orqanları tərəfindən qadağan olunması.

**HƏBSXANA** *is.* [*ər.* həbs və *fars.* ...xanə] Dustaqların saxlandığı yer, ev, bina; dustaqxana, qazamat, zindan. *Çar hökuməti yıxılandan sonra Cavahir həbsxanadan çıxdı.* T.Ş.Simurq.

**HƏBSXANAÇI** *is.* Həbsxana gözətçisi.

**HƏCC** *is.* [*ər.*] Müsəlmanlarda: zilhiccə ayında Məkkədə ziyarət mərasimini yerinə yetirmə. *Bəhs ilə həccə gedən yorulub yolda qalar.* (Ata. sözü). *Getdi həccə atası, ta oluna "hacı" xitab; Kim ona "hacı" desə, bil ki, deyir böhtanı.* S.Ə.Şirvani.

**HƏCƏMƏT** *is.* [*ər.*] Xalq təbabətində: xəstə adama küpə salıb qan almaqdan ibarət müalicə üsulu, habelə müalicə məqsədilə qan almaq, qanı sormaq üçün işlədilən buynuzşəkilli alət. *Şeyx Şabanın arvadı Gülsüm xala da məhəllədə məşhur idi, çünki yaxşı .. çöp ötürərdi, noxud falı açardı və hacəmət qoyardı.* Ə.Haqverdiyev. *Kəndin bir kişisi, qadını, cavanı, qocası, uşağı yox idi ki, Zeynəb qarının həcəmət və zəlisini görməmiş olaydı.* S.S.Axundov.

**HƏCM** *is.* [*ər.*] 1. Bir şeyin kub vahidləri ilə ölçülən uzunluğu, hündürlüyü və eni. *Həndəsi cismin həcmi. Kubun həcmi. Binanın həcmi.*

2. Ölçü, böyüklük, miqdar və s. baxımından bir şeyin tutumu. *Çəlləyin həcmi. Vaqonun həcmi. – Külli miqdarda neft və qaz yalnız böyük həcmdə boşluqları, yani müəyyən məsamələri olan süxurlarda yerləşir.* "Neft və qaz quyularının qazılması". // *məc.* Böyüklük, ölçü, kəmiyyət və s. cəhətdən bir şeyin miqyası. *İşin həcmi. Tikinti işlərinin həcmi. – Nizami qoltuğundan böyük bir dəftər həcmində bir məktub çıxarıb Fəxrəddinə verdi.* M.S.Ordubadi.

◊ **Həcm ölçüləri** – maye və dənəvər maddələrin ölçüləri (litr, kubmetr və s.).

**HƏCMCƏ** *sif.* Həcminə, böyüklüyünə, tutumuna görə, içinə ala biləcəyi şeyin miqdarına görə. *Həcmcə bu çənlərdən hansı böyükdür? Həcmcə kiçik çəllək. – Müharibənin son aylarında daha yeni radiolokasiya qurğuları işlədilmişdir. Bu qurğular həcmcə çox kiçik olub təyyarəvuran zenit toplarının mərmiləri daxilində yerləşir.* "Radiolokasiya".

**HƏCMİ** *sif.* [*ər.*] Həcm cəhətdən, həcm baxımından, həcmlə bağlı. *Həcmi təhlil.*

**HƏCMLİ** *sif.* Həcmcə iri olan; böyük, tutumlu. *İri həcmli sistern. – Bir tərəfdə müxtəlif həcmli ekskavatorlar torpağı qazır, bir tərəfdə parovozlar xəndəkdə fit verəverə platformalardan ibarət qatarları bu ekskavatorların yanına gətirir.* Ə.Sadıq.

**HƏCV** *is.* [*ər.*] Bir şəxsə, ictimai quruluşa, yaxud həyatdakı mənfiliklərə qarşı yönəldilmiş istehzalı, kəskin, acı, kinayəli yazı. *Mirzə Ələkbər Sabirin həcvləri. "Molla Nəsrəddin" məcmuəsində çap olunmuş həcvlər.* – [Qacar:] *Vətən! Çoxmu sevir məni o vətən? Mənə həcv yazır hər yoldan ötən.* S.Vurğun. [Xan:] *Hə, bəs nə oldu? Həcv deyən dilin niyə tutuldu?* B.Vahabzadə. □ **Həcv etmək** – haqqında həcv yazmaq, ələ salmaq, istehza etmək. *Niyə həcv eyləmisən Cürmini, ey can Yusif! Dilü-canım sənə qurban ola, canan Yusif!* S.Ə.Şirvani.

**HƏCVÇİ** *is.* və *sif.* Həcv yazan, həcvgu. *XIX əsr ədəbiyyatımızın ən qüvvətli həcvçi şairi Qasım bəy Zakirdir.*

**HƏCVÇİLİK** *is.* Həcv yazma.

**HƏCVGU** *is.* və *sif.* [*ər.* həcv və *fars.* ...gu] *köhn.* bax **həcvçi**. *Həcvgu şair.*

**HƏCVİYYAT** *top.* [*ər.* "həcv" söz. cəmi] *köhn.* Həcv məzmunlu əsərlər. // Boş, bayağı, mənasız əsərlər.

**HƏCVİYYƏ** *is.* [*ər.*] Qısa satirik şeir; epiqram.

**HƏCVYAZAN** bax **həcvçi**.

**HƏCZ** *is.* [*ər.*] *köhn.* 1. Tutub saxlama, tutma.

2. Müsadirə.

**HƏDD** *is.* [*ər.*] 1. Sərhəd, hüdud.

2. *məc.* Hədd-hüdud, son, nəhayət. *Uşağın sevincinin həddi yox idi.* ◻ **Hədd qoymaq** – hüdud qoymaq, məhdudlaşdırmaq, normaya tabe etmək. *Sevgiyə hədd qoymaq, düzü, günahdır.* B.Vahabzadə. **Həddən artıq (çox, ziyadə)** – son dərəcə çox, hədsiz. *..İndi yazmalı mətləblər çoxdur, danışmalı sözlər həddən artıqdır.* C.Məmmədquluzadə. *Babayev onun həddən ziyadə böyük olan qaloşlarına baxıb birdən soruşdu.* H.Seyidbəyli. **Həddən aşmaq** – bax **həddini aşmaq**. *Həddən aşıb büxlü-həsəd, şərarət; Yoldaş yoldaşına eylər xəyanət.* Q.Zakir. **Həddindən artıq (çox, ziyadə)** – bax **həddən artıq (çox, ziyadə)**. *Rəna və Nizami Fəxrəddinin köməyindən həddindən ziyadə razı qaldılar.* M.S.Ordubadi. *Pristav həddindən artıq dil töküb naqqallıq eləyən Məşədi Nurunun üzünə tərs-tərs baxıb aralandı.* Ə.Abasov. **Həddindən aşmaq** – bax **həddini aşmaq**. *Qətibənin iztirab və həyəcanı həddindən aşmışdı.* M.S.Ordubadi. **Həddini aşmaq** – həddi-hüdudu aşmaq, son dərəcə çox olmaq, həddi keçmək. *Qəhrəmanın balaca Sabirə olan məhəbbəti həddini aşır.* S.Rəhimov. *Həddini aşan ötkəmlik elə bil Hidayəti ayıltdı.* B.Bayramov.

3. *riyaz.* Dörd əməldə (toplama, çıxma, vurma, bölmə) işlədilən rəqəmlərin hər biri.

◊ **Həddim (həddin, həddi) nədi(r)** – nə cəsarət sahibiyəm (sahibsən, sahibdir) – itaətkarlıq, mütilik bildirir. [Hacı Salah:] *Xeyr, ağa, mənim nə həddim var ki, sənin* [vəzirin] *sirrini xalqa yayam.* M.F.Axundzadə. [Molla:] *Xeyr, qibleyi-aləm! Mənim həddim nədi sənə güləm.* "M.N.lətif." **Həddini bildirmək** – dərsini vermək, yerini bildirmək, yerində oturtmaq; cəzalandırmaq. **Həddini bilmək (tanımaq)** – öz hərəkətində, davranışında, danışığında hədd-hüduda riayət etmək, ədəb dairəsindən kənara çıxmamaq, cığırından çıxmamaq. [Zeynal:] *..Qudurğanlıq sizə xeyir gətirməz. Həddinizi bilin.* C.Cabbarlı. [Bəhram:] *Öz həddini tanı, Fitnə! Məğrur olma xoş səsinə!* A.Şaiq. **Kimin həddi var, nə həddi var** – heç kim cəsarət edə bilməz, heç kəsin cəsarəti çatmaz (hədə bildirir). *Soltan İbrahimin otağına kimin həddi vardı ki, gəlsin.* (Nağıl). [Hüseynqulu ağa:] *..Kimin həddi var, bundan sonra mənim əmrimdən çıxsın..* S.S.Axundov.

**HƏDD-HESAB** *is.* [*ər.*] Say, miqdar. *Qızıl Arslandan xəlifəyə məktub aparan heyəti İraqın hədd-hesaba gəlməyən atlıları istiqbal edirdi.* M.S.Ordubadi. ◻ **Həddi-hesabı olmamaq** – sayı-hesabı olmamaq. [Devlər] *bir az sonra qızlara o qədər zər-zibadan paltar gətirdilər ki, həddi-hesabı olmadı.* (Nağıl). *Sahilboyu uzanan küçədə həddi-hesabı olmayan dükan var idi.* Q.İlkin.

**HƏDD-HÜDUD** *is.* [*ər.*] Hədd, son, axır, intəha. *Ağbulaq dağlarının bütün gözəllik və üstünlükləri Sevildə .. həddi-hüdudu olmayan xoş bir təsir buraxırdı.* S.Rəhimov. *Dəmirin bu dəqiqə sevincinin həddi-hüdudu yox idi.* Ə.Vəliyev.

**HƏDDİ-BÜLUĞ** *is.* [*ər.*] İnsanın cismən və ruhən yetkinləşdiyi və vətəndaşlıq hüququ aldığı yaş. ◻ **Həddi-büluğa çatmaq (yetişmək, yetmək)** – həmin yaşa çatmaq. *Nəhayət, Səfər min zəhmətlə böyüyüb həddi-büluğa yetişdi..* Çəmənzəminli. [Mərcan bəy:] *Mənə qəyyum lazım deyil, Allaha şükür, həddi-büluğa çatmışam, ağlım başımdadır.* Ü.Hacıbəyov.

**HƏDƏ** *is.* [*ər.*] Qorxu gəlmə, bir şeylə qorxutma, dəhşətləndirmə; hədə-qorxu, təhdid. *Qızdan qəti söz aldım ki, atasının hədəsinə baxmayaraq, o bir də belə bir işə baş qoşmayacaqdır.* S.Rüstəm. ◻ **Hədə gəlmək (etmək)** – bir şeylə qorxutmaq, hədələmək. *Ölüm belə gələ bilmir izdihama qorxu, hədə; Şairə el məhəbbəti qalib gəlir ölümə də.* B.Vahabzadə.

**HƏDƏF** *is.* [*ər.*] 1. Tüfəng, top və s. atarkən güllənin, mərminin və s. dəyməli, vurmalı olduğu şey, yer; nişanə. *Hədəfi nişan almaq. Güllə hədəfə dəymədi. – ..Onlar hər ikisi birlikdə ova çıxır, Gülbaharın atdığı güllələr birbaş hədəfə dəyirdi.* S.Rəhimov. *Hüseyn qalxıb həmən göyün qatına; Şığıyıb bir anda cumur hədəfə.* M.Rahim.

2. *məc.* Təqib, yaxud töhmət, istehza, müzakirə və s. obyekti olan adam. *Qurbanlı uzun-uzadı mühakimələr yürütdü və fikirlərində də Ruhnəvaz xanımı hədəf etdi.* Çəmənzəminli. *Kiçik oğrulardır hədəfin*

*sənin; Böyük oğrulardan xəbərsizmisən?* B.Vahabzadə.

3. *məc.* Məqsəd, qəsd, məram kimi götürülən şey. [Gündüz Gülşənə:] *Bax, bibi, .. məktəbdə uşaqlar ilə dünya səyahətinə çıxmışdıq. Hər bir hədəfimiz bir dilək adası idi.* C.Cabbarlı. *Cavad yoldaşları ilə birlikdə damarlarda qanı donduran soyuqlara sinə gərərək, həmişə məqsədə, hədəfə doğru irəliləyir.* Ə.Vəliyev.

**HƏDƏQƏ** *is.* [*ər.*] *anat.* Göz almasının yerləşdiyi çuxur; göz çuxuru. *Sultanın gözlərinin gilələri öz hədəqəsində tez-tez sağa-sola gedib-gəldi.* İ.Hüseynov.

◊ **Gözləri hədəqəsindən çıxmaq** – bax **göz**.

**HƏDƏ-QORXU** bax **hədə**. *Gəlin, bu hədə-qorxudan Xəlilin pərt olduğunu düşünüb, ona kömək etmək istədi.* M.Hüseyn. *Həkim möhkəm durdu, o karıxmadı; Hədə-qorxudan da bir şey çıxmadı.* B.Vahabzadə.

◊ **Hədə-qorxu gəlmək** – bax **hədə gəlmək** (“**hədə**”də). *Padşah Rövşəni yanına dəvət edib, ona hədə-qorxu gəldi.* (Nağıl). *Gülsəhər inad eləyir, Dildar isə hədə-qorxu gəlirdi.* Ə.Vəliyev.

**HƏDƏLƏMƏ** “Hədələmək”dən *f.is.*

**HƏDƏLƏMƏK** *f.* Hədə gəlmək, qorxutmaq, hədə-qorxu gəlmək, təhdid etmək. *Baldızı, Məsməni hədələyir, “ərinin əmrindən çıxmağa ixtiyarın yoxdur” – deyirdisə də, bir təsiri olmayır.* S.Hüseyn. *Bircə Lətif özünü yoldaşları arasında çəkir, hamını öz iradəsinə tabe etməyə çalışır, ona qulaq asmayanları hədələyirdi.* H.Seyidbəyli.

**HƏDƏLƏYİCİ** *sif.* Hədələyən, qorxuducu, təhdidedici, hədə-qorxu gələn, hədə-qorxu ifadə edən. *..Hədələyici sözlər Mirzə Cəlildə yeni bir qüvvə oyatdı.* S.Vəliyev.

**HƏDƏR** *sif.* [*ər.*] Boş-boşuna, əbəs, heç bir nəticə verməyən; mənasız, faydasız. *Qəssab Həsən aralıqda hədər ölümdən qorxub, özünü adamların içinə soxdu.* Mir Cəlal. □ **Hədər(ə) getmək** – boşa çıxmaq, heç bir nəticə verməmək, faydası olmamaq, əbəs yerə sərf olunmaq. [Nərimanov:] *Zəhmətiniz, deyəsən, hədər getdi, çox təəssüf!* Q.İlkin. [Aydının] *bütün zəhmətləri hədərə getmişdi.* H.Seyidbəyli.

**HƏDƏRƏN-PƏDƏRƏN** *is.* Boş, mənasız, cəfəngiyat, tartan-partan, çərən-pərən sözlər. [Arvadı ustaya:] *Əşi, cin-zad səni vurub, ağlını-zadını çaşdırmayıb ki, hədərən-pədərən danışırsan, buğda nədir?* Çəmənzəminli. *..Qalan yüz on beş kağızda da bu cür hədərən-pədərəndən savayı özgə bir mətləb yoxdu.* C.Məmmədquluzadə.

**HƏDİK** *is.* Qarğıdalı, buğda, noxud, lobya, mərci və s.-dən suda (bəzən də ət və qovrulmuş soğanla) bişirilən xörək adı. *Noxudu, buğdanı, mərcini, lobyanı bir-birinə qarışdırıb, qazana töküb hədik bişirdikdən sonra qonşulara paylayardılar.* H.Sarabski.

**HƏDİS** *is.* [*ər.*] *din.* Məhəmməd peyğəmbərin qanun hökmündə olan sözlərinə verilən ad. *Başında ağ araqçın olan, gümüş toqqalı, qırmızısaqqal bir kişi isə təkər səslərinə, tıqqıltıya baxmadan adamlara hədis danışırdı.* Mir Cəlal.

**HƏDİYYƏ** *is.* [*ər.*] Bağışlanan şey, bəxşiş, sovqat, töhfə, ərməğan. *Məhərrəm əmi ilk dəfə Rəmziyyənin görüşünə gəldiyi zaman ona üzgörüşü olaraq kiçik bir çanta hədiyyə gətirmişdi.* A.Şaiq. [Əbdüləli bəy Gülüşə:] *Bu kiçik hədiyyəni qəbul etmənizi rica edirik.* C.Cabbarlı. // Yadigar. *Onun divarları al-əlvan naxış; Əsrdən-əsrə hədiyyə qalmış.* S.Vurğun.

**HƏDSİZ** *sif.* Həddi-hüdudu olmayan, həddən artıq, saysız-hesabsız, hədsiz-hesabsız. *Uşaqlar göz yaşlarını bir dəqiqədə unutdular və .. kərbəlayını hədsiz şadlıq ilə əhatə etdilər.* Çəmənzəminli. *Getdikcə böyük və əzəmətli şəhər oyanırdı. Ani kimi görünən sakitlik hədsiz bir qaynarlığa çevrilirdi.* S.Rəhimov.

**HƏDSİZ-HESABSIZ** bax **hədsiz**. *..Əngin fəzada hədsiz-hesabsız ulduzlar sayrışır.* S.Rəhimov. [Babək:] *Xəlifə və sarayın hədsiz-hesabsız vergiləri hamını cana gətirib..* M.Rzaquluzadə.

**HƏDSİZ-HÜDUDSUZ** *sif.* Həddi-hüdudu olmayan, ucsuz-bucaqsız, nəhayətsiz, sonsuz. *Hədsiz-hüdudsuz çöllər.*

**HƏDYAN** *is.* [*ər.*] Tərbiyəsiz, ədəbsiz, hərzə, əsassız sözlər; söyüş. *Keçən sözü çəkmə üzə, amandı; Hədyan danışmışam, laf eyləmişəm.* Aşıq Ələsgər. [Bədircahan:] *Ağzına*

*gələn hədyanı danışma, heyvan oğlu heyvan.* N.Vəzirov. // *sif.* Tərbiyəsiz, ədabaz, yava, ağzıpərtov. *Borcumuzdur, Vətən hər sahədə əmr etsə bizə; Qoymayın tərbiyəsiz kimsəni, hədyan oxusun!* Ə.Vahid.

**HƏFRİYYAT** *is.* [*ər.*] *köhn.* Arxeoloji qazıntılar; qazıntı işləri.

**HƏFTƏ** *is.* [*fars.*] Şənbədən bazar gününə qədər yeddi günə bərabər vaxt ölçüsü vahidi. *Həftənin birinci günü. Bütün həftəni işləmək. – Dolandı həftələr, dolandı aylar; Sənətlə bir yerdə ucaldı Aygün.* S.Vurğun. *Həftələr, aylar keçir; Axşamlı-səhərli; Bəzən şirin, bəzən zəhərli.* R.Rza. // Hər hansı gündən başlayaraq hesablanan yeddigünlük vaxt, müddət. *Xəstəlik iki həftədən bəridir ki, davam edirdi.* M.S.Ordubadi. *Əhmədov bir həftə deyildi ki, buraya, tikinti işinə icraçı mühəndis təyin olunmuşdu.* Mir Cəlal. // Bir hadisəyə və ya bir şeyə, tədbirə həsr edilmiş yeddigünlük müddət. *Yaşıllaşdırma həftəsi. Uşaq ədəbiyyatı həftəsi. Ədəbiyyat və incəsənət həftəsi.*

◊ **Həftə səkkiz, mən doqquz** – həmişə, daima, tez-tez. *Həftə səkkiz, mən doqquz xəstələnir. Həftə səkkiz, mən doqquz maşın xarab olur.* – [Fərhad] *həftə səkkiz, mən doqquz kağız yazıb, Aslandan pul istəyirdi.* C.Cabbarlı. [Yunis xalasına:] *Budur, Yaqut ərə getdiyi üç ay deyil, amma axır zamanlar həftə səkkiz, mən doqquz gəlib, anasının yanında qalır.* Ə.Məmmədxanlı.

**HƏFTƏAŞIRI** *zərf* Həftədən-həftəyə, hər həftə(də). *Həftəaşırı dənizə getmək.*

**HƏFTƏBAŞI** *zərf* Həftədə bir dəfə (bir qayda olaraq həftənin axırında). *Həftəbaşı ova getmək. Həftəbaşı hesabat vermək.*

**HƏFTƏBAZARI** *is.* Həftədə bir dəfə (əsasən bazar – istirahət günü) düzəldilən bazar, alış-veriş. [Ocaqverdi:] *Sabah həftəbazarına inək aparacağam satmağa, satıb, gətirib pulunu verərəm.* Ə.Haqverdiyev. *Şamaxı yolundan, Quba yolundan və bütün yuxarıda saydığımız məhəllələrdən aşağıda – bir meydançada o zaman həftəbazarı olardı.* H.Sarabski.

**HƏFTƏBECƏR** *is.* Duza qoyulmuş kələm, bibər, pomidor, xiyar, xırda balqabaq və s.-dən ibarət şoraba. *Xörəyin yanına həftəbecər qoymaq.*

**HƏFTƏLİK** *is.* Rəqəmlərdən sonra gələrək işin neçə həftə davam etdiyini və ya etməli olduğunu göstərir. *Üç həftəlik iş qalıb. Dörd həftəlik ezamiyyət. – Müəllim* [şagirdlərini] *iki həftəlik yaz tətilinə buraxmışdı.* S.Hüseyn. [Cuma:] *Bir həftəlik məzuniyyətim var.* Ə.Əbülhəsən. // *sif.* Həftədə bir dəfə çıxan, buraxılan, çap olunan. *Həftəlik qəzet. Həftəlik jurnal. – Həftəlik "Qüsli-vətən" ruznaməsi 139-cu nömrəsində yazır ki, dekabr və yanvar ayında Peterburqda əmələ gələn "övrət cəmiyyəti" xeyli calallı imiş.* C.Məmmədquluzadə. // Bir həftəlik müddəti nəzərdə tutan, bir həftədə əldə edilən, alınan, istehsal olunan. *Həftəlik plan. Həftəlik məlumat. Həftəlik gəlir.*

**HƏKƏM** *is.* [*ər.*] *köhn.* İki tərəf arasında olan mübahisəni həll etmək üçün seçilən adam; münsif, jüri. [Ev sahibi bəy dedi:] *O qoca kəndlini həkəm seçək, nə desə ona razı olaq.* S.S.Axundov. *Camaat sakit durub tamaşa edirdi. Yalnız bir ağsaqqal qaydaya baxırdı. Bu, həkəm imiş.* Çəmənzəminli.

**HƏKİM** *is.* [*ər.*] 1. Ali tibb təhsili olan adam; təbib, doktor. *Uşaq həkimi. Göz həkimi. Diş həkimi. Sanitar həkimi. – ..Mənim xahişimə görə bacım oğlunu gətirmişdi bizə ki, həm bir-iki ay bizə qonaq olsun, həm də İrəvan həkimləri uşaqları müalicə eləsinlər.* C.Məmmədquluzadə. *Həkimlərin məsləhətilə atamgil məni yaylağa göndərməli oldular.* İ.Əfəndiyev // Keçmişdə, ümumiyyətlə, adamları, ya heyvanları müalicə etməklə məşğul olan adama verilən ad. *Həkim gəlib padşahın başının üstündə əyləşdi.* "Məsum". *Həkimlərin dediyinə görə, Atabəyin ciyərləri soyuqlamışdı.* M.S.Ordubadi.

2. *klas.* Alim, filosof. *O, həkimü ədibü şair idi; Şeir fənnində xeyli mahir idi.* S.Ə.Şirvani.

**HƏKİMANƏ** *sif.* və *zərf* [*ər.* həkim və *fars.* ...anə] 1. Hikmətli, ağıllı, müdrik(anə), fazilanə, dərin. *Həkimanə söz. – Nitqdəndir bəlalər insanə; Nitq elə hər sözü həkimanə.* S.Ə.Şirvani.

2. *köhn.* Həkimə (alimə, filosofa) yaraşan bir tərzdə; alimcəsinə, filosofcasına, alim kimi, filosof kimi, ağıllı. *Həkimanə bir əda ilə*

*danışmaq. Hakimanə hərəkət etmək. – Sərxoşluq ilə ömrünü sərf eyləmə, Vahid! Arif ona derlər ki, hakimanə dolansın.* Ə.Vahid.

**HƏKİMBAŞI** *is. köhn.* Baş həkim, həkimlərin başçısı. *Günün birində həkimbaşı küçədə çıxır mollanın qabağına.* "M.N.lətif.". [Odabaşı:] *Mirzə Mehdi həkimbaşı həftədə iki-üç dəfə onu yoluxurdu.* Ə.Haqverdiyev. // Hörmətlə həkimə müraciət. [Nurcahan:] *Başına dönüm, həkimbaşı, bu suyu bir baytal verib mənim azarıma.* N.Vəzirov.

**HƏKİMXANA** *is.* [*ər.* həkim və *fars.* ...xanə] Tibb məntəqəsi, xəstəxana, poliklinika. [Rüstəm:] *Deyərsən bəlkə* [sədr] *subaydır, yox, arvadı oxumuş müəllimə, bacıları həkimxanada işləyirlər.* M.İbrahimov. *Gedək həkimxanaya; Tez sarıyım yaranı.* B.Vahabzadə.

**HƏKİMLİK** *is.* Həkim sənəti, həkimin işi, peşəsi; doktorluq; təbabət. [Fərhad:] *..Musa ilə də belə danışmışıq ki, bir yerdə gedək Xarkov şəhərinə, orada həkimlik oxuyub qurtaraq.* Ə.Haqverdiyev. [Sadıq kişinin övrəti ərinə:] *A kişi, qaç bazara.. Qaç tez usta Hüseynin yanına, onun həkimlikdə səriştəsi çoxdu..* C.Məmmədquluzadə. ☐ **Həkimlik etmək** – təbabətlə məşğul olmaq, doktorluq etmək (bir peşə kimi).

**HƏKK** *is.* [*ər.*] Hər hansı bir material (metal, ağac, daş, şüşə və s.) üzərində metal qələmlə çuxur və ya qabartma şəklində açılmış naxış, yazı və s.; oyma. ☐ **Həkk etmək** – həmin üsulla bir şeyin üzərində naxış açmaq, yazı yazmaq. [Cahandar ağa] *elə bil evindəki hər şeyi görmək, onları hafizəsində həkk etmək istəyirdi.* İ.Şıxlı. **Həkk olunmaq** – 1) həmin üsulla naxış açılmaq, yazı yazılmaq; 2) *məc.* Həmişəlik qalmaq, unudulmamaq (zehnində, qəlbində və s. sözlərlə). *Elə bil qızın bütün xüsusiyyəti, boybuxunu Şahmarın qəlbində həkk olunmuşdu.* B.Bayramov. *Qayalara həkk olmayan söz itər; Bu bahardan o bahara iz itər.* M.Araz.

**HƏKKAK** *is.* [*ər.*] Metal, daş və s. üzərində polad qələmlə yazı, şəkil və s. nəqşlər oyan sənətkar; qravüra ustası, qravüraçı, oymaçı.

**HƏKKAKLIQ** *is.* Həkkakın sənəti; qravüraçılıq, oymaçılıq.

**HƏQARƏT** [*ər.*] 1. *is.* Hörmətsizlik, saygısızlıq, alçaqlıq, təhqir; alçaldıcı, heysiyyətə, mənliyə toxunan hərəkət, söz və s. *Xan buyuran qulluqlarda qaim ol; Gör düşmənə nə həqarət eylərsən.* M.V.Vidadi.

2. **Həqarətlə** şəklində *zərf* – alçaq nəzərlə, yuxarıdan-aşağı, saymazyana, nifrətlə. *Nə baxmaqdır mənə, ay müddəi, çeşmihəqarətlə?* S.Ə.Şirvani.

**HƏQİQƏT** *is.* [*ər.*] 1. Doğrudan, həqiqətən olmuş və ya olan şey, hadisə və s. *Həqiqət belədir. Həqiqəti olduğu kimi danışmaq. Həqiqət acı da olsa, demək lazımdır. Bunların heç biri həqiqətə oxşamır. – Siz bunu sanmayın həqiqətdir; Damağım gəldi, bir zərafətdir!* M.Ə.Sabir. *Nə odlar görmüsən!.. Bu bir həqiqət! Fəqət darılmamış sana təbiət!* S.Vurğun. // Bir şeyin əsli, mahiyyəti, künhü. *İşin həqiqəti yenə də müəyyən edilmədi. – Axirüləmr, İbrahim, yəni bizim yalançı İbrahim məcbur oldu ki, açıb işin həqiqətini* [qıza] *desin.* (Nağıl). *Mübahisə zamanı həqiqət üzə çıxır.* H.Seyidbəyli. // Düzlük, vicdan, yaxşılıq, xeyirxahlıq, ədalət. *Həqiqət aramaq. – ..Həqiqət axtarılan yerdə də mütləq ixtilaf olur.* C.Məmmədquluzadə. *Qəlbimiz məşəl olsa; Aydınlatsa zülməti; Onda yəqin taparıq; Əsrlərin içində; Gizlənən həqiqəti.* R.Rza.

2. Həyatda, təcrübədə sınanmış fikir, mülahizə, mühakimə. *Hamıya məlum bir həqiqət. Bu, sınaqdan keçmiş həqiqətdir.*

3. Doğrudan da, həqiqətən. *Bu yerlər həqiqət gözəldir. – Bədircahan həqiqət doğru deyir ki, onun ürəyi yanmır.* N.Vəzirov. [Sultan bəy:] *Hə, yaxşı tanıyıram, həqiqət* [Mürsəl] *çox gözəl kişi idi.* Ü.Hacıbəyov.

**HƏQİQƏTÇİ** bax **həqiqətpərəst**.

**HƏQİQƏTÇİLİK** bax **həqiqətpərəstlik**.

**HƏQİQƏTƏN** *zərf* [*ər.*] Doğrudan, doğrudan da, gerçəkdən, əslində. *O həqiqətən böyük alimdir. Həqiqətən gözəl oxuyur. ..Həqiqətən baxmağına dəyər. – Bu müddət içərisində Əfruz bacı həqiqətən bir çox şeylər öyrənmişdi.* S.Rəhimov. *Züleyxa həqiqətən Dilbərlə Fərman arasında olan sevgidən xəbərdar idi.* Ə.Sadıq.

**HƏQİQƏTPƏRƏST** *is.* [*ər.* həqiqət və *fars.* ...pərəst] Həqiqəti, düzlüyü, ədaləti

sevən, istəyən və onun uğrunda mübarizə edən adam; həqiqətçi.

**HƏQİQƏTPƏRƏSTLİK** *is.* Həqiqəti, düzlüyü, ədaləti sevmə; həqiqətçilik.

**HƏQİQİ** *sif.* [*ər.*] 1. Həqiqətən mövcud olan və ya olmuş, həqiqətə uyğun olan; gerçək, real. *Həqiqi vəziyyət.* – *Məsafə və zaman göz işləməyən bir zülmət içində sanki öz həqiqi ölçüsünü itirmişdi.* Ə.Məmmədxanlı. // Saxta, süni, yapma, yalançı olmayan; əsil. *Həqiqi simasını göstərmək.* – [Nadir bəy:] *Dərin bir eşq, həqiqi bir məhəbbət daima dilsizdir.* H.Cavid. [Usta] *ilk dəfə olaraq həqiqi eşqin nə olduğunu duydu.* Çəmənzəminli. // Düz, doğru, səhih. *Həqiqi söz.* – *Həqiqi yol ilə, getdiyim yerdə; Kəsib qabağımı sən, dayan, dedin.* Aşıq Hüseyn.

2. Əsil mənada, necə lazımsa elə, əsil. *Həqiqi dost. Həqiqi sənətkar.* – [Şair Ərəstun:] *Belə ki, hay-küy yox, şerin əvəzində özünü vəkil seçib əl-qolunu ölçə-ölçə danışmaq yox, həqiqi sənəti yaratmaq lazımdır.* S.Rəhimov. *Müharibə göstərdi ki, ancaq çətinlikdən qorxmayan adam həqiqi qəhrəman ola bilər.* Ə.Sadıq.

3. *xüs.* Elmi cəhətdən müəyyənləşdirilmiş, hadisənin mahiyyətinə uyğun. *Həqiqi istilik tutumu. Həqiqi azimut.*

◊ **Həqiqi (hərbi) xidmət** – kadr qoşunlarında (hərbi) xidmət. **Həqiqi üzv** – bəzi elmi idarələrin, cəmiyyətlərin və s. üzvünə verilən ad. *Elmlər Akademiyasının həqiqi üzvü.*

**HƏQİQİLİK** *is.* Həqiqi olma, düzlük, doğruluq, gerçəklik, reallıq. *Faktların həqiqiliyi. Deyilənlərin həqiqiliyinə şübhə yoxdur.* – [Qətibə:] *..yalnız sevgidə deyil, süründürücülük bütün məsələlərdə müvəffəqiyyəti və həqiqiliyi uduza bilər..* M.S.Ordubadi.

**HƏQİR** *sif.* və *zərf* [*ər.*] 1. Qədir-qiyməti, hörməti, etibarı olmayan; alçaq. *Həqir baxma mənə qilü-qal bilməz isəm; Ki əhlihal arasında bəlayəm, ey bülbül!* Qövsi. *Molla Cəfərqulu arvadlara həqir bir nəzərlə baxan kişilərdən idi.* N.Nərimanov.

2. *klas.* Təvazökarlıqla özünü başqasının qabağında kiçiltmə, heç kimi göstərmə, özünə əhəmiyyət verməmə mənasında işlənir. [İskəndər:] *Sən də gəl abidin yanında məni; Qızartma, burax bu həqir bəndəni.* A.Şaiq.

3. Kasıb, yoxsul, miskin, zəlil. *O birisi sadə və həqir geyimli otuz, ya bir qədər artıq sinli bir adam idi.* C.Məmmədquluzadə. *Şəhər kənarında bir; Daxma var idi həqir.* Ə.Nəzmi.

**HƏQİRANƏ** *zərf* və *sif.* [*ər.* həqir və *fars.* ...anə] 1. Həqir olana yaraşacaq bir tərzdə; qorxa-qorxa, çəkinə-çəkinə, yazıq-yazıq, alçala-alçala. *Həqiranə cavab. Həqiranə yalvarmaq.*

2. Həqarətlə, alçaq nəzərlə. *Rəşid Minaya doğru həqiranə baxıb getdi.* İ.Musabəyov.

**HƏQQ** [*ər.*] b a x **haqq**[2] 1-ci mənada. [Rəsul:] *Qadir həqdən mən bir dilək dilədim; Şükür, muradımı verdi, ah, mənim.* "Aşıq Qərib". *Gecə-gündüz budur həqdən diləyim; Hifz eyləsin yaman bəladan səni.* Q.Zakir.

**HƏQQANİYYƏT** *is.* [*ər.*] *köhn. kit.* 1. Haqq və ədalətə uyğunluq; ədalət, insaf, vicdan. *Həqqaniyyət öz yerini tapdı.* – [Məhərrəm:] *Mən həqqaniyyət tərəfdarıyam.* C.Cabbarlı.

2. **Həqqaniyyətlə** şəklində *zərf* – ədalətlə, insafla, vicdanla.

**HƏQQÜLQƏDƏM** *is.* [*ər.*] *köhn.* Xəstə üstünə gələn həkimə verilən zəhmət haqqı. *Üzüörtülü arvad .. bir cüt dolaq, bir tumanbağı və bir araqçın çıxarıb həkimin qabağına qoydu. Bu da həkimin həqqülqədəmi idi.* Çəmənzəminli.

**HƏLAK** *is.* [*ər.*] Ölmə, məhv olma, ölüm, məhv, tələf. *Şah xoşhal olub buyurdu ki: – Razıyam onun həlakına, sabah bu tədbir tamam və kamal icra olunacaqdır.* M.F.Axundzadə. □ **Həlak etmək** – 1) öldürmək, məhv etmək, yox etmək, tələf etmək. *Cütçü baba böylə deyib qeyznak; Eylədi ol qırğını ol dəm həlak.* A.Səhhət. *Kəndin mollası da ona get demiş; Get öz düşmənini həlak et demiş.* M.Müşfiq; 2) *məc.* üzüb əldən salmaq, həddən artıq yormaq, üzmək. *Çox işləyib özünü həlak etmək.* **Həlak olmaq** – 1) ölmək, məhv olmaq, tələf olmaq. *Qərib bir müddət yol gəldikdən sonra altındakı at tab gətirməyib həlak oldu.* "Aşıq Qərib". *Yavər Vətən yolunda həlak olmuşdu.* M.İbrahimov; 2) *məc.* yorulub əldən düşmək, həddindən artıq yorulmaq,

üzülmək. *İşləməkdən həlak olmaq. – Xalidə bir saat əvvəl yuxudan oyanmışdı. Ağlamaqdan həlak olurdu.* S.Hüseyn.

**HƏLBƏTTƏ** "Əlbəttə" sözünün danışıqda işlənən forması. *Həlbəttə, gələcəyəm.* – [Xoca Əziz:] *Həlbəttə ki, sən bilirsən; Dərdimi pünhan, ay həkim!* "Məsum". [Hamı:] *Bu nə sözdür?! Həlbəttə, gəlin arvad olar!* Ü.Hacıbəyov.

**HƏLƏ** *zərf* 1. İnkar cümlələrində gözlənilən bir işin vaxtında baş vermədiyini, gecikmiş olduğunu bildirir – hələ də. *Camaat hələ yığılmayıb. Məktub hələ mənə çatmayıb. Soyuqlar hələ düşməyib. – Uzaqdan görünən meşəli silsilə dağların başı sübh dumanından hələ təmizlənməmişdi.* Q.İlkin. *Qızlar təpənin quzeyində hələ günəşdən yanmamış göy otluqda bir müddət sakitcə əyləşdilər.* İ.Hüseynov. // İndiyədək, hələ də, hələ ki. *Halbuki boş otaqlarda haradansa gətirilmiş, hələ qaydası ilə qoyulub yerbəyer edilməmiş şkaflardan, stollardan, lülələnmiş kağızlardan başqa bir şey yox idi.* Mir Cəlal. *Alaqaranlıqda hələ yer ilə göy bir-birindən seçilmir, .. bildirçinlər, turaclar səs-səsə verib doğacaq günəşi pişvaz edirdi.* M.Rzaquluzadə. // Vaxt, yer bildirdikdə – artıq, daha. *Hələ uşaqkən təbiəti sevmişəm. Hələ bu gün onu görmüşəm. Hələ məktəbdə oxuyarkən biz dostlaşmışdıq.* – [Maya] *hələ ömründə çobanların yaşadığı alaçıqda olmamışdı.* M.İbrahimov.

2. Bir də, əlavə, üstəlik. *Hələ bir məsələ də qalmışdır. Hələ iddiası da var! Hələ xəstəyə də baş çəkməliyəm. Hələ bazara da gedəcəyəm. – Hələ daş yol da təmir edilməli idi.* Ə.Əbülhəsən. // Bu vaxta qədər, indiyədək, hələ ki. *Mən hələ bilmirəm ki, onun fikri nədir? Gözü hələ yuxuya getməyib. Hələ ay çıxmayıb. – Divar peçləri hələ təzəcə qalanırdı.* S.Rəhimov. *Əşrəf həyatında hələ heç bir qəhrəmanlıq eləməmişdi.* S.Rəhman. // Hələlik, indi. *Sən hələ uşaqsan, başa düşməzsən. O bu işdə hələ naşıdır. Kollektivlə hələ tanış deyil. Hələ yeni məlumat yoxdur. – Oğlan, sən uşaqsan, cavansan hələ; Yenicə cisminə düşüb vəlvələ.* M.P.Vaqif. *Kəhər hələ kifayət qədər qurumamış yumşaq otu böyründən söküb yeyirdi.* M.İbrahimov. // Bir şeyin qurtarmadığını, davamı, dalı, sonrası olacağını bildirir. *İşlər hələ qurtarmayıb. Səninlə hələ sonra danışacağıq. Hələ söhbətimizin dalı qalıb.* – [Mərcan bəy:] *Saat ikidir, hələ dörd saat var.* Ü.Hacıbəyov.

**HƏLƏ-BELƏ** *zərf* Səbəbsiz, niyyətsiz, ciddi məqsəd olmadan. *Şəfiqə sözünü deməyib, cavab verdi ki, heç, əzizim, bir şey olmayıb, hələ-belə yanına gəlmişəm.* İ.Musabəyov.

**HƏLƏ-HƏLBƏT** *zərf dan.* Mütləq, hökmən, qəti, necə olur olsun. *Hələ-həlbət onu bu gün görməliyəm. Hələ-həlbət saat beşdə bizdə ol. – Göndər uşağı, Şahbacını eylə xəbərdar; Gəlsin hələ-həlbət.* M.Ə.Sabir.

**HƏLƏ-HƏLƏ** b a x **hələm-hələm**. *Bu işi hələ-hələ adam bacarmaz.* – [Rüstəm kişi:] *Yox, Yarməmməd, Qara Kərəmoğlunu sən o qədər də zəif bilmə. Bərk adamdır, hələ-hələ geri çəkilən deyil.* M.İbrahimov. [Eldar:] [Göyərçinlər] *xoşlayıb yurd-yuva saldıqları yerləri hələ-hələ tərk etməzlər.* M.Rzaquluzadə.

**HƏLƏLİK** 1. *zərf* Bir müddət, bir qədər, bir müddətə qədər. *Hələlik burada otur. Hələlik gözləməli olacaqsan. Hələlik bunu özündə saxla. – Sonudur qış gününün, toplayaraq var gücünü; Saxlamaq fikrinə düşmüş hələlik öz gücünü.* S.Rüstəm. *Murad öz sualına özü cavab verir, hələlik arvadına məsələni bildirmirdi.* Ə.Vəliyev. // Müvəqqəti (olaraq). *Hələlik onun yanında yaşa. Pulu hələlik cibində saxla.* – [Leytenant:] *Hələlik ev-zad düzəldənəcən burada qalarsınız.* İ.Əfəndiyev. // Hazırda, bu saat, indi. *Hələlik evə tələsirəm, məşğul ola bilməyəcəyəm. Hələlik işini gör, söhbət sonraya qalsın.*

2. **Hələlik!** – xudahafiz! görüşənədək! sağ ol! [Tahir:] *Hələlik, – deyə, gülə-gülə uzun-caydaq qıza əl elədi və sürətlə uzaqlaşdı.* M.Hüseyn. *Sənubər havanın qarışmağına .. əhəmiyyət verə bilmədi, mövsümi paltosunu geydi, anasına "hələlik" demədən çıxdı.* B.Bayramov.

**HƏLƏM-HƏLƏM** *dan. sif.* Hər hansı, hər bir. [Molla deyir:] *O, hələm-hələm adamların gözünə görünməz.* "M.N.lətif." *Çünki Mina xanımı təsvir etmək hələm-hələm adamın hünəri deyil.* M.İbrahimov. // *zərf* Tez, asanlıqla. [Gülzada:] *Ancaq, ağa, Səlbi çox*

*həyasız arvaddır, hələm-hələm boynuna götürməyəcək.* Ə.Vəliyev. [Nuriyyə:] *Fiziki işə lap körpəlikdən adət etdiyim üçün hələm-hələm yorulmazdım.* İ.Əfəndiyev. // *zərf* Boş-boşuna, əsassız, səbəbsiz. *Mən də hələm-hələm bayraq taxmaram; Göyümdə göyərən göydələnlərə.* M.Araz.

**HƏL-HƏLBƏT** *dan.* b a x **hələ-həlbət**. [Reyhan xanım Mirzə Fətəliyə:] *Bir şərtlə ki, həl-həlbət gələsiniz.* M.İbrahimov.

**HƏL-HƏLƏ** *is.* [*ər.*] Hay-küy, qalmaqal, həyəcan. *Bu sayaq həl-hələylə* (z.) *bir anda; Gəldi çatdı o vahəyə karvan.* A.Səhhət.

**HƏLİM**[1] *sif.* [*ər.*] 1. Xasiyyətcə, təbiətcə yumşaq (adam haqqında). *Həlim adam.* – *Məkrli qadındı, gülçöhrə qızdı; Həlimdi, kövrəkdi, sərtdi, quduzdu...* M.Araz. *Əsmət həlim qarı Bakıda çoxdan; Yaşayır yanında böyük oğlunun.* M.Rahim. // Sakit, dinc (heyvan haqqında). *Həlim inək.* – *Sən, ey yoldaşımın həlim kəhəri; Hanı cəbhələrin o qəhrəmanı?* M.Rahim. *Çox çəkməzdi, görərdin, o həlim heyvan, budur, dönüb gəldi, sahibinin ətəklərinə sürtündü.* Mir Cəlal.

2. Xoşagələn, ürəyəyatan, qulağa xoş gələn (səs haqqında). *Müəllim bir qədər həlim və mülayim səslə soruşdu..* Ə.Vəliyev.

**HƏLİM**[2] *is.* [*ər.*] İçərisində düyü və s. qaynadılması nəticəsində hasil olan qəliz su. *Süzülmüş düyünün üstünə ılıq su gəzdirməklə onu yuyurlar ki, həlimi getsin.*

**HƏLİMANƏ** [*ər.* həlim və *fars.* ...anə] b a x **həlimliklə** (“**həlimlik**”də).

**HƏLİMAŞI** *is.* Tamamilə həll olub həlməşik hala gələnədək suda bişirilən ət və buğdadan ibarət, adətən səhər tezdən yeyilən horra.

**HƏLİMLƏŞMƏ** “Həlimləşmək”dən *f.is.*

**HƏLİMLƏŞMƏK** *f.* Həlim olmaq, yumşalmaq (xasiyyətcə, rəftarca) (b a x **həlim**[1]). *Nəhayət, xan həlimləşməyə başladı, Sənəm xanımın da iztirablarını azaldıb, onu ağır bir qayğıdan qurtardı.* Çəmənzəminli.

**HƏLİMLİK** *is.* 1. Yumşaqlıq (xasiyyətcə, təbiətcə). *Cahıllıqda həlimlik, qocalıqda səlimlik.* (Ata. sözü).

2. **Həlimliklə** şəklində *zərf* – yumşaqlıqla, mülayimliklə, xoş dillə, xoş rəftarla, həlimanə. *Həlimliklə rəftar etmək.*

**HƏLQƏ** b a x **halqa**. *Yüz həlqə edib zülfi-pərişanını çin-çin; Hər həlqə ilə boynuma bir silsilə saldın.* Qövsi. *Həlqə get-gedə sıxılırdı.* H.Seyidbəyli.

**HƏLQƏVİ** [*ər.*] *klas.* b a x **halqavari**.

**HƏLL**[1] *is.* [*ər.*] 1. Ətraflı fikirləşib düşündükdən sonra çətin və ya dolaşıq bir məsələ haqqında bu və ya digər nəticəyə, qərara gəlmə, ona cavab tapma. *Problemin həlli.* // Bir məsələ haqqında qərara gəlmə, nəticə çıxarma. [Rüstəm bəy] *həllinə aciz olduğu məsələlərdə məlumatlı adamlara və kitabxanalara müraciət edərdi.* Çəmənzəminli. □ **Həll etmək** – qərara gəlmək, nəticəyə gəlmək. *Yüz kari-müşkülə gər qoyasan əl; Göz yumub açınca səyin eylər həll.* Q.Zakir. [Rəhim bəy] *Məşədibəylə ixtilafını biryolluq həll etmək bəhanəsilə qardaşı evinə getdi.* M.Hüseyn.

2. Həyata keçirmə (keçirilmə), yerinə yetirilmə. *Məsələnin qoyuluşu, müzakirəsi və həlli elə gəlib yetişmişdi ki, burada hiylə olduğunu heç kəs güman etməzdi.* Mir Cəlal. □ **Həll etmək** – həyata keçirmək, yerinə yetirmək. *Çətin texniki məsələləri həll etmək.* – [Nəsib dayı] *..həmişə ən çətin, mübahisəli məsələləri də sakitliklə həll etməyi lazım bilirdi.* İ.Şıxlı.

3. Axtarılan rəqəmi, cavabı və s. tapma. *Krossvordun həlli. Tənliyin həlli.* □ **Həll etmək** – axtarılan cavabı, rəqəmi tapmaq. [Nuriyyə:] *Ən çətin məsələ-misallar seçib həll elədim.* İ.Əfəndiyev.

**HƏLL**[2] [*ər.*] 1. *is. xüs.* Bir cismin və ya mayenin suda və ya başqa maye içərisində öz tərkibini pozub onunla qarışması, onun içində əriməsi. □ **Həll etmək** – bərk və ya maye maddəni suda və ya başqa mayedə əritmək. *Şəkəri suda həll etmək.*

*2. sif.* Çox yetişmiş, dəymiş və ya çox bişmiş; yumşaq. *Həll pomidor. Həll* (z.) *bişirmək.* – [Yaşlı kişi:] *Tam yetişmiş*, *həll bir ənciri əlimə alaraq* [Şirinnaza] *tərəf tolazladım.* S.Hüseyn.

**HƏLLAC** *is.* [*ər.*] Pambıqatan, yunatan (usta). *Sən ac, mən ac, qonşu həllac.* (Ata. sözü). *Yunatan həllaclar burada dolanar, həftələrlə bir güzəranlı alaçıqda məskən salıb, yun atar..* S.Rəhimov.

**HƏLLACLIQ** *is.* Pambıqatma, yunatma sənəti.

**HƏLLEDİCİ**[1] *sif.* Bir şeyin inkişafını, gələcəyini təmin edən, həll edən. *Həlledici amil. Həlledici mərhələ.* // Başlıca, ümdə, əsas, ən mühüm. *Həlledici şərt. – Axırıncı iki gün ərzində düşmənin tank hücumlarının dəf edilməsində İdrisin batalyonundakı minaatanlar bölüyü həlledici rol oynamışdı.* Ə.Məmmədxanlı.

**HƏLLEDİCİ**[2] *sif. xüs.* Başqa maddəni içərisində həll edən, əridən. *Kolbanı cizgiyə qədər həlledici maye ilə dəqiq surətdə doldurduqdan sonra cizgidən yuxarıda qalan damcıları süzgəc kağızı ilə qurudurlar.* "Miqdari kimyəvi analiz". // *is.* Başqa maddəni öz içərisində həll edən, əridən maddə. *Bu maddələr bərk və maye halda, bəzən də onların suda* (*və ya başqa həlledicilərdə*) *məhlulu şəklində tətbiq edilir.* "Qeyri-üzvi kimyadan təcrübə məşğələləri".

**HƏLLƏM-QƏLLƏM** *sif. dan.* 1. Cüvəllağı, fırıldaq, haramzadə, cəncəl. [Xan Kazıma:] *Ay gədə, sən çox həlləm-qəlləm adama oxşayırsan, .. xatanı məndən sov.* Çəmənzəminli. [Həsən] *həlləm-qəlləm adam imiş.* Qantəmir.

2. Qarışıq, dolaşıq. [Gəray ağa:] *Bilirsən, bəydadaş, işlər necə həlləm-qəlləmdir?* S.Rəhimov. *Məktubun sonunda mənə tapşırır ki, o lotulara deyim*: *– Həlləm-qəlləm işlərdən əl çəkməsələr, hamısını adbaad yazacaq.* "Kirpi".

**HƏLLƏNMƏ** "Həllənmək"dən *f.is.*

**HƏLLƏNMƏK** *f.* Nəşələnmək, xoşlanmaq, xoşallanmaq. *İsti qum mənə ipək yataq kimi gəldi, uzandım, həllənməyə başladım.* Çəmənzəminli.

**HƏLLOLUNMAZ**[1] *sif.* Həll oluna bilməyən, yaxud həlli çox çətin olan. *Həllolunmaz məsələ. – Sanki Şirzadı, yaxud Salmanı seçmək* [Pərşan] *üçün həllolunmaz bir müşkülə dönmüşdü.* M.İbrahimov.

**HƏLLOLUNMAZ**[2] *sif.* Başqa maddələr içində həll olmayan, ərimeyən.

**HƏLMƏŞİK** *sif.* Horra halında olan, qatı, qəliz. *Həlməşik kütlə. – İsti su götürdükdə nişasta yapışqanlaşaraq həlməşik təbəqə əmələ gətirir.* "Dərman növləri".

**HƏM** *bağl.* [*fars.*] 1. Üstəlik, dəxi, ...da (də). *Fələk, bari cəfalar eyləyib, sən həm qəm artırma; Əlindən gəlmədisə əhli-dərdə çarəsaz olmaq.* S.Ə.Şirvani. *Qəzetin yazmağına görə, bu növ şəxslər Naxçıvan fəqarəsində həm olublar.* N.Vəzirov.

2. Təkrar edilərək işləndikdə həmcins cümlə üzvlərini bir-birinə bağlayır. *Həyat həm gülmək, həm ağlamaqdır; Lakin daha xoşdur döyüş çağları..* M.Müşfiq. *Əgər Şahmar bu gün çıxmasa, həm Nərminədən əli üzüləcək, həm imtahanlara gecikəcəkdi.* B.Bayramov. // Eyni vəzifədə təkrar edildikdə sonuncu "həm" bağlayıcısı "həm də" şəklində işlədilir və cümlənin bitdiyini, fikrin sona yetdiyini bildirir. *Həbib çay içir, Gözəl fındıq sındırır, söhbət həm qızışır, həm də şirinləşirdi.* Ə.Vəliyev. *Tapdıq həm ağlayır, həm də işarə ilə anasına müəllimin yanındakı sarıqlı şeyi göstərirdi.* Ə.Vəliyev.

**həm...** [*fars.*] Mürəkkəb sözlərin əvvəlinə gətirilərək şəriklik, birgəlik, qarşılıq mənasını bildirən sifət və isimlər düzəldilir; məs.: həmsöhbət, həmrəy, həmsərhəd, həmyerli, həmvətən.

**HƏMAĞUŞ** *zərf* [*fars.*] Bir-birini qucaqlamış halda, qucaqlaşaraq. □ **Həmağuş olmaq** – bir-birini qucaqlamaq, qucaqlaşmaq. *Vaqifi-pürmöhnət çox çəkib həsrət; Ta səninlə xəlvət ola həmağuş.* M.P.Vaqif. [Xavər Arifə:] *Baxdım ki, sevilməyənlər əsla; Layiq deyil olmağa həmağuş.* H.Cavid.

**HƏMAHƏNG** *sif.* və *zərf* [*fars.*] Bir-birinə uyan, uyğun (səslər, rənglər və s. haqqında). *Həmahəng səslər. – ..Oynayanlar kütləsinin həmahəng hərəkəti ilə* [Mirzağa] *da irəli hərəkət edirdi.* S.Hüseyn. □ **Həmahəng olmaq** – bir-birinə uyğun olmaq, müvafiq olmaq, uymaq. *Dərin bir sükut ətrafı bürüyərək kainatla həmahəng olmuşdu.* Çəmənzəminli. [Əlikram Hidayətə:] *Ay sağ ol, gərək yaradıcılıqla şəxsiyyət, amal həmahəng olsun.* B.Bayramov.

**HƏMAİL** *is.* [*ər.*] 1. Qılınc, tapança və s. silah asmaq üçün çiyindən aşırılan qayış; çiyin qayışı. *Misri qılınc həmaildi belində; Geyər hər vaxt al-qumaşı Koroğlu.* "Koroğlu".

2. Boyundan asılan, üzəri pilləklə bəzədilmiş qadın bəzəyi. *"Gəlinlər həmaili"*

(əsər adı). – [Leylək] *həm üzük, həm sırğa, həm həmail, həm də bilərzik almaq istədi.* S.Rəhimov. *Ay qız, sənə mailəm; Boynunda həmailəm; Dost payı şirin olar; Hər nə versən qailəm*. (Bayatı). // Çələng. *Pərşan ağlı-sarılı müxtəlif çöl güllərindən həmail qayıraraq arasına qırmızı lalələrdən naxış vurub boynundan asmışdı.* M.İbrahimov.

3. İnanca görə, gözdəymədən, xəstələnməkdən və s. qorunmaq üçün boyundan asılan dua, tilsim, pitik. *Arxeoloji qazıntılar zamanı çoxlu həmail aşkar edilir.*

**HƏMAN** b a x **haman**.

**HƏMAVAZ** *sif.* və *zərf* [*fars.*] Səsləri bir-birinə uyğun; həmahəng. ◻ **Həmavaz olmaq** – səs-səsə vermək. *Gah eyləyibən sürudlər saz; Bülbüllərə oldular həmavaz.* Füzuli. *Azər uyurkən, şaqraq; Bir sədа sazla həmavaz olaraq; Onu qaldırdı yataqdan erkən.* H.Cavid.

**HƏMAVAZLIQ** *is.* Səslər arasında uyğunluq, ahəng; həmahənglik.

**HƏMBAB** *sif.* [*fars.*] *dan.* Bir-birinə uyğun, münasib, bab. // *məc.* Sevgili, məhbubə. *Könlümün sevdiyi gözəl həmbabı; Zülfləri bənd edib on dörd kitabı.* Şair Vəli.

**HƏMCİNS** *is.* [*fars.* həm və *ər.* cins] 1. Bir cinsdən olan, cinsi bir olan; eynicinsli. *Həmcins heyvanlar.*

2. Bir cinsə, bir qövmə mənsub olan, eyni cinsdən, eyni qövmdən olan, öz cinsindən olan (məcazi mənada adətən insan, adam nəzərdə tutulur). *Həmcinslərim təmam getmiş; Söz mülkündən nizam getmiş.* Füzuli. [Nadir bəy:] *..Həmcinsinə qıymaqdan, yaxıb-yıxmaqdan zövq alanlar, başqasının fəlakətində səadət arayanlar birər adi cəlladdan başqa bir şey deyildir.* H.Cavid.

◊ **Həmcins cümlə üzvü** *qram.* – cümlədə eyni sintaktik vəzifəni yerinə yetirən cümlə üzvü.

**HƏMCİNSLİK** *is.* Bir cinsdən olma.

**HƏMÇƏKİ** *sif.* Çəkisi bir olan, eyni ağırlıqda, çəkidə olan.

**HƏMÇİNİN** *bağl.* [*fars.*] 1. Habelə, ...da (...də), həm, həm də. *Usta Zeynal həmçinin bir arif kişi idi. O da gözəl şeirlər oxuyardı.* Ə.Haqverdiyev. [Hacı Osman:] *..Dəyirmanını verdin əkinçilərə, yerlərini həmçinin, onda pəs necə dolanırsan?* N.Vəzirov.

**HƏMD** *is.* [*ər.*] *din.* Şükür, təşəkkür, minnətdarlıq. *İşimiz boş danışıq, həmdü sənadır, demədim? Ay baba, işlərimiz xeyli fənadır, demədim?* C.Cabbarlı. ◻ **Həmd olsun** – "Allaha şükür", "Allaha şükür olsun" mənasında Allaha minnətdarlıq bildirən dini təbir. *Həmd olsun, özünüz görürsünüz, kimlərdir şəriətini bilməyib, kor-koranə əl-ayaq çalanlar..* C.Məmmədquluzadə.

**HƏMDƏM** *is.* [*fars.*] Yaxın yoldaş, yaxın dost, sirdaş. *Hardasız, ey şad keçən dəmlərim; Hardasız, ey sevgili həmdəmlərim?* A.Səhhət. *Hanı dostlar və həmdəmlər? Gələcəkmi keçən dəmlər?* S.Vurğun. // Məc. mənada. *Bax, indi təbiət bizə yoldaş; Yoldaş deyil, hətta bizə həmdəm.* M.Müşfiq. *Həmdəmisən günəşgözlü səhərin; Bəxtin gülür aynasında Xəzərin.* S.Rüstəm.

**HƏMDƏMLİK** *is.* Yaxın yoldaşlıq, sirdaşlıq, yaxın dostluq, çox yaxınlıq. *Həmdəmliyim ilə ar qılma; Məndən nifrəti şüar qılma.* Füzuli.

**HƏMDƏRD** *is.* [*fars.*] Dərdləri bir olan adamlardan hər biri, birilə bir dərddə olan. [Leyla xanım:] *Həmdərdik, qardaş*, *qorxma, sözünü de...* N.Vəzirov. *Qoy Sadıqa desinlər lağlağı, amma o kişi ölən günə kimi mənim rəfiqim, müsahibim və həmdərdimdi.* C.Məmmədquluzadə.

**HƏMDƏRS** *is.* [*fars.* həm və *ər.* dərs] Bir sinifdə və ya bir yerdə oxuyan.

**HƏMDİN** *is.* [*fars.* həm və *ər.* din] Eyni dinə mənsub adamlardan hər biri; dindaş.

**HƏMD-SƏNA** *is.* [*ər.*] *din.* Allaha səna və təşəkkür, minnətdarlıq, razılıq. [Dərviş Ruqiyyəyə:] *Bunların hamısının əvəzində Allah səni yetirdi və mən də "bəsdi" deyib ona həmdi-səna dedim.* A.Divanbəyoğlu.

**HƏMƏQİDƏ** *sif.* və *zərf* [*fars.* həm və *ər.* əqidə] Eyni əqidədə olan; həmməslək. *Rzaquluxan ilə həməqidə olan müsyö Lui də .. İran səfərinə hazırlaşmaqda idi.* M.S.Ordubadi. *Diqqətlə qulaq asan Hüseyn Məhbusi* [Kərimxana] *hədsiz bir sevinc və maraqla*: *– Məni də özünüzə bir yoldaş bilin, həmməslək, həməqidə* (is.) *bilin.* M.İbrahimov.

**HƏMƏL** *is.* [*ər.*] Ərəb astronomiyasında Qoç bürcünün adı. *Günəş həməl bürcünə yaxınlaşdığı dəqiqədə Sultan Toğrulun qapısında vurulan kərənayxana Novruz bayramı mərasiminin başlandığını xəbər verdi.* M.S.Ordubadi.

**HƏMƏN** [*fars.*] 1. *əvəz.* Həmin, haman, o. [Cavad bəy:] *Elə işlərin üstündə həmən adamı divara söykəyib başına güllə çaxarlar, qalar yerində..* N.Vəzirov. *Gətirir fikrimi mənim tüğyana; Həmən diyardakı şumal buruqlar.* M.Müşfiq.

2. *zərf* O saat, dərhal, əlüstü. *Mən bu lövhələri xəstə, nəfəssiz; Seyr edərək həmən yüyürdüm səssiz.* S.Vurğun. *Əcəbcə işə düşdük, deyib güldüm özümə; Yay paltomun boynunu həmən çəkdim üzümə.* S.Rüstəm.

**HƏMƏSR** *is.* [*fars.* həm və *ər.* əsr] Bir əsrdə, bir dövrdə yaşamış və ya yaşayan, bir-birinin müasiri; çağdaş, əsrdaş. *Həməsr şairlər. – Həmsinlərin səfada, bağda; Həməsrlərin çəməndə, dağda.* M.Ə.Sabir. *Deyirəm, bəlkə də həməsrlərim; Şerimi gözləmir o qədər mənim?* B.Vahabzadə.

**HƏMFİKİR** *is.* və *sif.* [*fars.* həm və *ər.* fikr] Eyni fikirdə olan, fikirləri, görüşləri, rəyləri bir olan; həmrəy, həmməslək, məsləkdaş. *Həmfikir adamlar. Onlar bu məsələdə həmfikirdirlər. – Gəl bu hicran dərdini Nima, çəkək bir yerdə biz; Həmfikir, həmdərd olaq, məskən salarsaq harda biz.* Şəhriyar. *Həsən bəy və onun həmfikirləri* [Nəcəf bəy Vəzirov, Heydəri və başqaları] *maarifpərvər, mütərəqqi və vətənini sevən adamlar idilər.* M.İbrahimov.

**HƏMHƏMƏ** *is.* Pıçıltı, pıç-pıç. *Həmhəmə başlayır div ilə pəri; Qorxudan qan olur xalqın ciyəri.* Şəhriyar.

**HƏMHÜDUD** *sif.* [*fars.* həm və *ər.* hüdud] Sərhədləri bir olan; yan-yana, bitişik, yapışıq olan; həmsərhəd. *Həmhüdud dövlətlər. –* [İran] *Qafqaz ilə həmhüduddur.* M.S.Ordubadi.

**HƏMHÜQUQ** *sif.* [*fars.* həm və *ər.* hüquq] Eyni hüquqa, bərabər hüquqa malik olan; bərabərhüquqlu. *Bütün xalqlar həmhüquqdurlar. Həmhüquq iqtisadi münasibətlər.*

**HƏMHÜQUQLUQ** *is.* Eyni hüquqa, bərabər hüquqa malik olma; bərabərhüquqluluq.

**HƏMXANA** *is.* [*fars.*] Bir evdə, bir mənzildə yaşayan adamlardan hər biri; qonşu, mənzil qonşusu. *Həmxanası qarşı evdən baxaraq; Rübabəyə zilləmişdi gözünü.* M.Müşfiq. *Köhnə mənzildə bir ildir ki, iki həmxana cırmaqlaşır.* S.Qədirzadə.

**HƏMXASİYYƏT** *is.* və *sif.* [*fars.* həm və *ər.* xasiyyət] Eyni xasiyyətdə olan, xasiyyətcə bir olan. *Atı at yanına bağlarsan, həmrəng olmasa, həmxasiyyət olar.* (Ata. sözü).

**HƏMİ** b a x **həm**. *Həmi sağdan, həmi soldan; Zənbur kimi sancdı birə.* Aşıq Ələsgər. [Cahan Əsgərə:] *Allaha şükür, həmi pulun var, həmi dövlətin var, həmi cavansan.* Ü.Hacıbəyov.

**HƏMİN** [*fars.*] Yaxında olan bir şeyi, ya şəxsi göstərmək üçün işlədilən əvəzlik. *Həmin qəzet. Həmin tələbə. – Sən bilirsən, mənim yaşım azdır; Anadan olduğum həmin yazdır.* A.Səhhət. *Birinci olaraq nəzərlərilə Fərmanın qəlbini dələn həmin qız bir kəklik cəldliyilə sıçrayıb maşına çıxdı.* Ə.Sadıq.

**HƏMİŞƏ** *zərf* [*fars.*] Daima, hər vaxt, hər zaman. *O, həmişə adamlardan uzaq gəzir. –* [Almaz:] *Mənim qapım dostlarımın üzünə həmişə açıqdır.* C.Cabbarlı. *Buna da şükr edib, "təvəkkül" – dedik; İmdadçün həmişə üz tutduq göyə.* B.Vahabzadə. // Arasıkəsilmədən, daim. *Oğul nankorların adəti budur: Günəşin nurunu həmişə udub; Cazibə alırlar, sürət alırlar..* M.Araz.

**HƏMİŞƏBAHAR** *is.* [*fars.*] 1. *bot.* İlin bütün fəsillərində çiçək açan cır qızılgül növü. *Saib saxsıdakı yeni açmış həmişəbaharı məzar üzərinə qoyub geri çəkilər.* H.Cavid.

2. Həmişə öz təravətini saxlayan; həmişəcavan. [Qəmər xanım:] *Rəhmətlik kişi də deyərdi ki, həmişəbaharsan, ay Qəmər!* M.İbrahimov.

**HƏMİŞƏCAVAN** 1. B a x **həmişəyaşıl**. *Enliyarpaq çinarlar, həmişəcavan ağaclar xiyabanın yaraşığıdır. – Ağaclar lütləşmiş olsa da, həmişəcavanlar onu gizlədə bilirdilər.* B.Bayramov.

2. *sif. dan.* Təravətini, gənclik görkəmini itirməyən; qocalmayan. *Həmişəcavan kişi.*

**HƏMİŞƏKİ** *sif.* və *zərf* 1. Həmişə olan, hər vaxt olan; hərvaxtkı, adi. *Həmişəki qayda. Həmişəki iş. – Sabahkı gün tarçı Əsədin*

*cənazəsi arabaya qoyulub, həmişəki adət üzrə "Ərrəhman" oxuna-oxuna qəbiristana aparıldı.* B.Talıblı. *Günün birində Təliə ilə vəliəhd və Qətibə bir yerdə idi, Qətibə həmişəki adəti üzrə onları bir yerdə buraxıb çıxdı.* M.S.Ordubadi.

2. **Həmişəkindən** şəklində – həmişə olduğundan, adi qaydadan. *Firidun darülfünundan çıxıb Şəmsiyyəyə dərs deməyə getdi. Qız həmişəkindən daha artıq bir səmimiyyətlə onu qarşıladı.* M.İbrahimov. *Bu gün dəniz həmişəkindən coşqun idi.* S.Vəliyev.

3. "kimi" qoşması ilə – həmişəki kimi, həmişə, hər vaxt olduğu kimi, adi qaydasında. *Qüdrət dinmədi, ayağa qalxdı və həmişəki kimi ağır-ağır yeriyib kabinetinə keçdi.* M.Hüseyn.

**HƏMİŞƏLİK** *zərf* Vaxtı məhdud olmadan, müddətsiz, əbədi, daim(i). *Dağda meşəlik; Gül, bənövşəlik; Mən həmişəlik; Bu balama qurban.* (Bayatı). [Qəmər:] *Vaxtımız çox olacaq. Mən burada həmişəlik doktor işləyəcəyəm.* S.Rəhman. [Sevinc Mahmuda:] *..Mən elə bilirdim ki, sən bugünkü iclasdan özün üçün həmişəlik bir nəticə çıxaracaqsan.* Z.Xəlil.

**HƏMİŞƏYAŞIL** *sif. bot.* Bütün ili yarpaqla (və ya iynəyarpaqla) örtülü. *Həmişəyaşıl ağaclar.*

**HƏMİYYƏT** *is.* [*ər.*] Vətən, ailə qeyrəti, namus, təəssüb. *Min elm deməkdənsə həmiyyət gərək olsun; Sözdən nə bitər, işdə həqiqət gərək olsun.* M.Ə.Sabir.

**HƏMİYYƏTLİ** *sif.* Həmiyyət sahibi olan; qeyrətli, namuslu, təəssübkeş. *Bu kəndin adamları istəyiblər, .. özlərini Astaranın qeyrətli və həmiyyətli adamlarına oxşatsınlar.* "Mol. Nəsr."

**HƏMKAR** *is.* [*fars.*] Biri ilə bir yerdə, bir sənətdə, bir peşədə işləyən adam; iş, sənət, ixtisas yoldaşı. *Veys yanını stula təzəcə qoymuşdu ki, həmkarlarının yerdə bardaş qurduğunu görüb, özü də elə onların yanında çömbəlib divara söykəndi..* Ə.Əbülhəsən. [Cəfərqulu] *baxırdı ki, görsün, həmkarlarından bura kim gəlib.* B.Bayramov.

◊ **Həmkarlar ittifaqı** – fəhlə və qulluqçuların mənafeyini qorumaq üçün əmək prinsipi üzrə onları birləşdirən kütləvi təşkilat.

**HƏMKƏNDLİ** *is.* Bir kənddə doğulmuş, orada yaşamış və ya yaşayan (adam). *Həmkəndliləri ilə görüşmək. Şəhərdə həmkəndlisinə rast gəldi. – ..Nəriman* [Nərimanov] *türkcə və rusca gözəlcəsinə yazıb-oxumaq bilirdi. Ona görə həmkəndlilərinin günü-gündən ona rəğbətləri artırdı.* Ə.Haqverdiyev.

**HƏML** *is.* [*ər.*] *klas.* Yük, ağırlıq.

◊ **Həml etmək** – 1) isnad etmək, izah etmək, yazmaq, aid etmək, səbəbini bir şeydə görmək. *Minanın hərəkətini dəli olduğuna həml etdilər.* Çəmənzəminli; 2) boynuna qoymaq, üzərinə yükləmək. [Haşım:] *Əgər iki min manata tamah edib bu məsləhətlərə dəyişməsəydim, həm* [pulu] *əlimdən dərviş alacaqdı, həm burada boynuma bir cinayət həml edib, məni hökumətə təslim edəcəkdilər..* B.Talıblı.

**HƏMLƏ** *is.* [*ər.*] Hücum, üzərinə atılma. *Həmlələr pozmuş, qoşun sındırmış, qala fəth etmiş əsgər sevinci ilə Durmuş .. yatağına girdi.* Mir Cəlal. *..Qaraca çobanın cürətli müqaviməti, iki qardaşı ilə birgə hələ ilk həmlədə beş-on atlını vurub-yıxmaları basqınçıların qəzəbini artırdı.* M.Rzaquluzadə. □ **Həmlə etmək** – hücum etmək, üzərinə atılmaq. *İş atışmadan ötüb şəmşir və xəncər ilə bir-birinə həmlə etməyə çatdı.* M.F.Axundzadə. *Ta ayın iyirmi doqquzuna kimi düşmənin tankları ilə piyadası batareyaya həmlə etdi.* Ə.Əbülhəsən. // Eyni mənada oyunda. *Hücumçuların həmlələri.* □ **Bir həmlədə** – dərhal, bir anda, bir dəfə həmlə etməklə. *Koroğlu bir həmlədə özünü Aslan paşaya çatdırdı.* "Koroğlu".

**HƏMMƏCLİS** *is.* [*fars.* həm və *ər.* məclis] Bir yerdə oturub-duran, məclis yoldaşı olan; həmnişin. *Hər kəs* [Lütfəli bəylə] *bir, ya iki dəfə həmməclis və həmsöhbət olsaydı, yəqin onu sevərdi..* İ.Musabəyov.

**HƏMMƏHƏLLƏ** *sif.* və *is.* [*fars.* həm və *ər.* məhəllə] Eyni məhəllədə doğulmuş, yaşamış və ya yaşayan. *Həmməhəllə uşaqlar.*

**HƏMMƏNA** *sif.* [*fars.* həm və *ər.* məna] Eynimənalı, birmənalı, mənası başqa sözün mənası ilə eyni olan. *Həmməna söz.*

**HƏMMƏSLƏK** *is.* [*fars.* həm və *ər.* məslək] Məsləkdaş, eyni məsləkdən olan, məsləkləri, əqidələri eyni olan. *Həmməslək*

*adamlar. – Diqqətlə Kərimxana qulaq asan Hüseyn Məhbusi hədsiz bir sevinc və maraqla: – Məni də özünüzə bir yoldaş bilin, həmməslək, həməqidə bilin, – dedi.* M.İbrahimov.

**HƏMMƏZHƏB** *is.* [*fars.* həm və *ər.* məzhəb] *köhn.* Eyni bir məzhəbə mənsub olan, inanan; dindaş. [Molla İbrahimxəlil:] *Həmi sənin təvəssütün həmməzhəblərin barəsində məqbul oldu, həmi mənim sözüm pozulmadı.* M.F.Axundzadə.

**HƏMNİŞİN** *is.* [*fars.*] Bir yerdə oturub-duran, dost, yoldaş, munis. *Həmnişinin bab elə; Görən desin, ha belə!* (Ata. sözü). *Qəm mərhələsində qalmışam fərd; Nə yar, nə həmnişin, nə həmdərd.* Füzuli.

**HƏMPEŞƏ** *is.* [*fars.*] Eyni peşə sahibi olan, peşələri eyni olan. *Danışdı teatrdan; aktyor sənətindən; həmpeşələrinin xidmətindən; bir az gileyləndi.* R.Rza.

**HƏMPİYALƏ** *is.* [*fars.*] Biri ilə həmişə bir yerdə içki içən, sərxoşluq edən adam. *Mənimlə daim o kəslər ki, həmpiyalə idi; Nə cam lütf edir indi, nə cam alır məndən.* Ə.Vahid.

**HƏMRAH** *is.* [*fars.*] Yol yoldaşı, yoldaş. [Əmrah:] *Həmrah bizlərdə yoldaşa deyirlər.* "Əmrah". [Alp Arslan:] *Aydın gözünüz, cümlə səadət bizə həmrah.* H.Cavid.

**HƏMRAHLIQ** *is. klas.* Yoldaşlıq, yol yoldaşlığı. *Ey bəxt, vəfasız olma sən həm! Həmrahlıq et, bizimlə bir dəm!* Füzuli.

**HƏMRAZ** *is.* [*fars.*] *klas.* Sirr yoldaşı, sirdaş. *Həmrazim idin şikayətimdə; Dəmsazim idin hekayətimdə.* Füzuli. *Badi-səba, əgər düşsə güzarın; Söylə xəlvət o həmraza bir xəbər.* M.P.Vaqif.

**HƏMRƏNG** *sif.* və *is.* [*fars.*] 1. Eyni rəngdə olan, eynirəngli. *Atı at yanına bağlarsan, həmrəng olmasa, həmxasiyyət olar.* (Ata. sözü).

2. *məc.* Uyğun, uyar, müvafiq, münasib, düz. ◻ **Həmrəng olmaq** – uyğunlaşmaq, uyğun olmaq, münasib olmaq. *Ey gül, bu mənə deyilmidir nəng; Kim, olmayasan mənimlə həmrəng.* Füzuli. *Demə bu misranın da əsil mənası bu imiş ki, dünyada keçinmək, güzəran etmək istəyirsən isə, camaat ilə həmrəng ol.* N.Vəzirov. *..Parlaq bahar səmasilə həmrəng olsun nəğmələrim?* M.Müşfiq.

**HƏMRƏY** *sif.* və *is.* [*fars.* həm və *ər.* rəy] Bir fikirdə, bir rəydə olan; həmfikir, yekdil. [Əmiraslan ağa:] *Hansınız mənimlə həmrəydir, buyursun, gözüm üstə yeri var.* S.S.Axundov. *Görünür ki,* [Şirin Rüstəmbəylə] *bəzi nöqtələrdə həmrəy deyildi.* Çəmənzəminli. ◻ **Həmrəy olmaq** – bir rəydə, bir fikirdə olmaq, həmfikir, yekdil olmaq. *N.Vəzirov yeni komediyaları və "Dərviş" imzalı publisist əsərləri ilə mollanəsrəddinçilərlə həmrəy olduğunu göstərirdi* "Əkinçi".

**HƏMRƏYLİK** *is.* Həmfikirlik, yekdillik. *Görüşlərdə həmrəylik. Məsələ barəsində yoldaşlar arasında həmrəylik yoxdur. – ..Yoldaşlarının həmrəyliyi* [Qəzənfəri] *daha çox sevindirirdi.* S.Vəliyev. // Hər hansı bir ictimai hərəkətə və ya fikrə fəal surətdə hüsnrəğbət göstərmə; fikir, mənafe birliyi. *Əməkçilərin beynəlxalq həmrəyliyi.*

**HƏMSAYƏ** *is.* [*fars.*] *köhn.* Qonşu. *Dedi: həmsayə, var nəyə meylin; Nə yeyirsən, nə istəyir könlün?* M.Ə.Sabir. *Anlar nə ata, nə ana, həmsayə bizim qız; Xan dostu! Düşübdür yeni sevdayə bizim qız.* Ə.Nəzmi.

**HƏMSAZ** *sif.* və *is.* [*fars.*] Bir-birinə uyğun gələn, uyan, münasib olan; uyğun. ◻ **Həmsaz olmaq** – uyğun gəlmək. *Demə ki, yaş ürəklə; Qanacaqla, hünərlə; Həmişə həmsaz olur.* B.Vahabzadə.

**HƏMSƏFƏR** *is.* [*fars.* həm və *ər.* səfər] Səfər yoldaşı, yol yoldaşı.

**HƏMSƏNƏT** *is.* və *sif.* [*fars.* həm və *ər.* sənət] Sənətləri, peşələri bir olan, sənət yoldaşı, iş yoldaşı. *Qonşuluq bir yana, axı biz – Qara Canbalayevlə mən, demək olar ki, həmsənət idik.* İ.Hüseynov.

**HƏMSƏRHƏD** *is.* [*fars.* həm, sər və *ər.* hədd] Ümumi sərhədi olan; qonşu, həmhüdud. *Həmsərhəd ölkələr.*

**HƏMSİN** *sif.* və *is.* [*fars.* həm və *ər.* sinn] Həmyaş, yaşıd, bir yaşda olan. *Fərman və Gövhərtac ikisi bir yerdə böyümüşdülər və həmsin idilər.* Ə.Haqverdiyev.

**HƏMSİNİF** *sif.* və *is.* [*fars.* həm və *ər.* sinif] 1. Məktəbdə eyni bir sinifdə oxuyan, sinif yoldaşı. *Həmsinif rəfiqələr.*

2. Eyni ictimai sinfə mənsub olan, eyni sinifdən olan. *Zakir özü Qarabağın xass-xalis nücəbalarından ola-ola, öz həmsinfinin ayıb*

*və qüsurunu belə açıq, mərdanə və şairanə söyləməyi, əlbəttə, şayani-təhsindir.* F.Köçərli.

**HƏMSİR** *is.* və *sif.* [*fars.* həm və *ər.* sir] Sirdaş. *Həmsir yoldaşlar. – Qasım bəy Zakirə gəldikdə, o da Molla Pənah kimi durnalardan xahiş eləyir ki, ondan ehtiyat etməsinlər və onu özlərinə həmsir, yoldaş və rəfiq hesab etsinlər.* F.Köçərli. [Nurəddinin] *həmfikri, həmsiri ancaq kitabları olmuşdu.* S.S.Axundov.

**HƏMSÖHBƏT** *is.* [*fars.* həm və *ər.* söhbət] Birisi ilə söhbət edən, söhbət yoldaşı; müsahib. *..Bir az zamanda Sona özü üçün həmsöhbət tapıb, gününü gah bağlarda və gah meşələrdə keçirirdi.* N.Nərimanov. [Bəhram:] [Pərini] *çağırım, bir az həmsöhbət olsun.* C.Cabbarlı.

**HƏMSÜFRƏ** *is.* və *sif.* [*fars.* həm və *ər.* süfrə] Bir süfrədə, bir masa arxasında, bir yerdə yeyib-içənlərdən hər biri; süfrə yoldaşı.

**HƏMŞƏHƏRLİ** *is.* və *sif.* Bir şəhərdə anadan olmuş, yaşamış və ya yaşayan, eyni şəhər əhalisindən olan; həmyerli. *Həmşəhərli dostlar.* – [Odabaşı:] *Bu şəxsi ki görürsən, mənim həmşəhərlilərimdəndir.* Ə.Haqverdiyev. *Həmşəhərlilər yaman başbaşa veriblər, – deyə Veysəl Kəngərli şayiə yayırdı.* Ə.Vəliyev.

**HƏMTA(Y)** *is.* [*fars.*] Həmyaş, yaşıd, yoldaş, tay. *Nəçidir şeirdə Bixud sənə həmta olsun.* S.Ə.Şirvani. *Qəsəbədə* [Nəcminin] *uzun illər dostluq etdiyi bir neçə həmtayından bircə Ağasəfər qalırdı.* Ə.Əbülhəsən.

**HƏMTAYFA** *is.* və *sif.* [*fars.* həm və *ər.* taifa] Eyni tayfaya mənsub olan, eyni tayfadan olan. *Amur çayı boyunca daurlar və onlarla həmtayfa olan adamlar yaşayırdılar.*

**HƏMVAXT** *sif.* [*fars.* həm və *ər.* vəqt] Bir vaxtda olan, bir vaxtda baş verən, vaxtca eyni olan.

**HƏMVƏTƏN(Lİ)** *sif.* və *is.* [*fars.* həm və *ər.* vətən] Bir vətəndən olan; vətəndaş, yurddaş. *Həmvətən dostlar. – Sanıram, ulduzlar həmvətənimdir; Demək, yer də mənim, göy də mənimdir.* M.Müşfiq. *Cavid həmişə xəlqimizin xatirindədir; Vahid, o yoxsa, ruhi ilə həmvətənlərik.* Ə.Vahid.

**HƏMYAŞ(LI)** b a x **yaşıd**. *Qorxusuz Xacoyla hünərli Dadaş; Hər ikisi oğlan, özləri həmyaş..* H.K.Sanılı. *İdrisi də o biri həmyaşlıları kimi çox tez səfərbərliyə aldılar.* M.Hüseyn.

**HƏMYAŞLIQ, HƏMYAŞLILIQ** b a x **yaşıdlıq**.

**HƏMYERLİ** *is.* Biri ilə bir yerdə doğulmuş: yurddaş, həmvətən. [Qədir] *Yevlaxda öz həmyerlilərinə rast gələndə onlar həmişə Qədiri kəndə dəvət edirdilər.* Ə.Sadıq. [Professor] *kəndlərinin yaşıllaşdırılması barədə bir-iki dəfə qəzetdə oxumuş, şəhərə gələn həmyerlilərindən eşitmişdi.* İ.Əfəndiyev.

**HƏMZAD** *is.* [*fars.*] 1. Yaşıd, eyniyaşlı.

2. İnsanla birlikdə doğulan ruh, can.

**HƏMZADLI** *is. məh.* Doğandan sonra uşağı ölən qadın. *Elə arvadlar olur ki, doğduğu uşaq qalmır, ölür. Onda deyirlər ki, bu arvad həmzaddı.* (Rəvayət).

**HƏMZƏ** *is.* [*ər.*] Ərəb əlifbasında boğazbağlı samit tələffüzünü göstərən işarə. *Ayn və həmzə səslərinin interferensiyası. Daxilində ayn və həmzə səsləri olan ərəb sözlərinin yazılış qaydası. – Hələ orta əsr ərəb dilçiləri ərəb dilinin özündə həmzə səsinin söz ortasında və söz qovuşuğunda itməsini göstərirdilər.* F.Ağasıoğlu.

**HƏMZƏBAN** *is.* [*fars.*] 1. Bir dildə danışan. *Şıq geyimli bir cəvani-xoşnişan olsaydım, ah! Bu pərilərlə doyunca həmzəban olsaydım, ah.* M.Ə.Sabir.

2. *məc.* Dilbir, həmfikir. *O gül mənə bu gecə həmzəban olan gecədir; Deyib, gülüb, danışıb, mehriban olan gecədir.* Ə.Vahid.

**HƏNA** *is.* [*ər.*] Xına. *Dünən oğlanı göndərdim, gedib Məşədi Məhəmməd Nəcəfin dükanından bir az həna gətirdi.* C.Məmmədquluzadə. [Gülnaz:] *Mənim başım hələ ağarmayıbdır ki, hənaya ehtiyacım ola.* Ü.Hacıbəyov.

◊ **Heç hənanın yeridir** – yersiz, münasibətsiz deyilən söz haqqında.

**HƏNALI** b a x **xınalı**. *Hənalı saç. – Səqfin yavıqlığındakı arvad yerlərində belə pərdələr qalxıb, hənalı əllər ustanı göstərirdi.* Çəmənzəminli.

**HƏNCAMA** b a x **rəzə**. *Qapının həncaması.*

**HƏNDBOL** *is.* [*ing.*] Əl topu oyunu. *Bizi hara aparır; Bu "yenilik" ədası? Həndbolun; Futbolun; Hakimlik iddiası?* B.Vahabzadə.

**HƏNDƏSƏ** *is.* [*ər.* əsli *fars.* əndazə] Riyaziyyatın cisimlərin səth formalarından və onların münasibətlərindən bəhs edən şöbəsi. *Həndəsə məsələləri. – Hər şəhrdə bir məktəbi-sənət açacaqdır; Oğlanlar alıb həndəsə, memar olacaqdır.* M.Ə.Sabir.

**HƏNDƏSƏŞÜNAS** *is.* [*ər.* həndəsə və *fars.* ...şünas] Həndəsə alimi, həndəsə mütəxəssisi, həndəsəni yaxşı bilən adam.

**HƏNDƏSİ** *sif.* [*ər.*] 1. Həndəsəyə, həndəsə elminə aid olan, həndəsə ilə əlaqədar olan. *Həndəsi üsul. Həndəsi aksiom. – Xalam mətbəxdə qutab üçün yoğurduğu kiçik kündələri oxlov altına salıb cığara kimi nazik və həndəsi çevrə kimi yuvarlaq yuxalar yayırdı..* Ə.Məmmədxanlı.

2. Xətlərdən, nöqtələrdən və sxematik fiqurlardan (üçbucaqlardan, konuslardan, əyri xətlərdən və s.) ibarət olan. *Həndəsi ornament. – Ax, bu dəmir ağaclar; Həndəsi üçbucaqlar; Dünyanın o başını; Çəkib evlərə bağlar...* B.Vahabzadə.

**HƏNDƏVƏR** *is.* Ətraf, dövrə, yan-yörə. *Həyətin həndəvəri. Evin həndəvərində dolanmaq. – Keşikçilər* [qulu] *Çənlibelin həndəvərində görüb, tutub Koroğlunun yanına gətirdilər.* “Koroğlu”.

**HƏNƏFİ** *is.* [*ər.*] Sünnilərin Əbu Hənifə təriqətinə mənsub olanları.

**HƏNƏK** *is.* [*ər.*] Zarafat. *Əvvəli hənək, axırı dəyənək.* (Ata. sözü). *Belə hənəkmi olur; Əl qan, üz qan, yaxa qan.* Sarı Aşıq. ☐ **Hənək etmək (eləmək)** – zarafat etmək, zarafatlaşmaq, hənəkləşmək, şuxluq eləmək. *..Qəvvas səsləndi .. and olsun cavan canuva, mən səniynən hənək eləyirdim.* (Nağıl). *Sarımtıl arılar, xallı kəpənək; Ballı çiçəklərlə eləyir hənək.* H.K.Sanılı.

**HƏNƏKÇİ** *sif.* Zarafat sevən, zarafatçı, zarafatcıl. *Hənəkçi oğlan.*

**HƏNƏKLƏŞMƏ** “Hənəkləşmək”dən *f.is.*

**HƏNƏKLƏŞMƏK** *qarş.* Bir-biri ilə zarafat etmək; zarafatlaşmaq. *Uşaqlar hənəkləşdilər.*

**HƏNGAM** *zərf* [*fars.*] *klas.* Vaxt, zaman, çağ. *Bu həngamda* (bu vaxtda, bu anda). *O həngamda* (o vaxtda, o anda). *Nuş olur canıma ət, xassə, o həngamda kim; Mən yeyəm, xırda uşaqlar baxa, ağlaşa, ətə.* M.Ə.Sabir.

**HƏNGAMƏ** *is.* [*fars.*] Qovğa, mərəkə, gurultu, gurultu-patırtı. *Bu nə həngamədir? – ..Fəxrəddin bu qədər böyük və dəhşətli həngaməni birinci dəfə gördüyü üçün qorxmuşdu.* M.S.Ordubadi. [Şəms Xəlilə:] *Şəhərdən güllə səsləri gəlir. Yenə bu nə həngamədir, bilmədiniz?* Ə.Məmmədxanlı. // Gurultulu mənzərə, tamaşa, məclis. *Cavanlar dünən yaman həngamə düzəltmişdilər. – Aşıq Ələsgər neçə ilin aşığıydı, amma belə həngamə heç harda görməmişdi.* “Aşıq Ələsgər”. [Xəlil:] *Nə gördüm, büsat və həngamə, vur-çatlasın, toy.* N.Vəzirov.

**HƏNİR** *is.* Yavaş səs. *Bir ağac yıxıldı yol qırağında; Bir hənir yox oldu yol qırağından..* M.Araz.

**HƏNİRTİ** *is.* Canlı səsinə oxşar yavaş səs, qulağa dəyən anlaşılmaz səs. *Uzaqdan hənirti eşitmək. – Gözləyirdim durub da pusquda mən; O da duydu hənirtimi birdən.* A.Səhhət. *Heyrətlə baxırdı uzaq-yaxına; Təbiət qoynunda bir hənirti var.* A.Şaiq.

**HƏNUZ** *zərf* [*fars.*] *köhn.* 1. Hələ, hələ ki. *Dedim: – Getmə, bala, hənuz uşaqsın; Dünyanın işini bilən tapılmaz..* M.Müşfiq.

2. İndi, indicə. *Dedi: “Qışdır, hənuz, həmsayə; Meyvə fəsli deyil, dayan yayə”.* M.Ə.Sabir.

**HƏPƏND** *is.* Axmaq, başıboş, gic; duzsuz (zarafatla yüngül söyüş məqamında işlənir). [Cəbi:] *Bir mənə deyən gərək ki, ay həpənd, sən nə girmisən meydana.* N.Vəzirov. [Qazı Xudayar bəyə:] *Bəli, gətdiyin iki girvənkə qənddi, zornan övrəti gətirib qatırıq sənin qoynuva. Get, ay həpənd!* C.Məmmədquluzadə.

**HƏPİR** *sif.* Xarab olmuş, çürük.

**HƏR** *əvəz* 1. Bir toplunun ayrıca götürülən fərdi, onu təşkil edən şeylərdən hər biri. *Hər adam. Hər ailə. Hər adambaşına.* ☐ **Hər bir** – b a x **hər.** *Hər bir adam. Hər bir şey. Hər bir təsadüfdə. Hər bir çətinlik qarşısında. – Əli yüz sirr oxuyur; Hər bir heyvan izində.* R.Rza. *Reyhan bütün dərslərindən; Hər bir zaman “beş” alardı.* M.Dilbazi. **Hər biri** – toplu halındakı adamlardan, ya şeylərdən ayrıca götürülmüşü. *Hər birinə tapşırıq vermək. Hər birini ayrıca dinləmək lazımdır. – Əgər*

*Məcnun, əgər Fərhad – olar kim, dərd çəkmişlər; Yığılsınlar, mənimçin hər biri çarə yazsınlar.* Qövsi. [Kərim baba ilə Ayrım qızı] *keçmiş igidliklərindən söyləyir, öyünməyə və hər biri özünü bəyəndirməyə çalışırdı.* A.Şaiq. // Bir çox hallarda əksinə, topluluq mənası verir. *Hər işə qarışmaq. Hər arzusunu yerinə yetirmək. – Xədicə hər istədiyini* [həyata keçirməyə] *adət etmişdi, ərköyün böyümüş bir qızdı.* S.Hüseyn. ☐ **Hər adam** – b a x **hər kəs**. *Bu qədər zurnaçı, züyçü əbəsdir; Hər adam bir quzu yemləsə bəsdir*.. M.Araz. **Hər an** – b a x **hər vaxt**. *Hər an gözləmək. – Görsə kim, bir fəqir edib üsyan; Lən edər ol fəqir üçün hər an.* S.Ə.Şirvani. **Hər cəhətdən (cəhətcə)** – tamamilə, bütünlüklə. *Dünyada hər cəhətcə bir-birinin eyni olan iki adam yoxdur.* Ə.Abasov. **Hər cür** – cürbəcür, müxtəlif. [Rəsul] *hər cür yeməkdən araya gətirdi.* "Aşıq Qərib". **Hər dəqiqə** – b a x **hər vaxt**. *Mən hər dəqiqə Bədirnisə xalanın içəri girəcəyindən qorxurdum.* M.Hüseyn. **Hər gün** – daima, həmişə. *Hər gün xeyrə açılmır dünyamızın bal ağzı.* M.Araz. **Hər kəs (kim)** – 1) hər bir adam, hamı, bütün adamlar. *Bundan hər kəsin xəbəri var. Şagirdlərdən hər kim çalışsa, usta ola bilər. – Hər kim məni, belə görə, bil, ağlar; Dağ, daş yanar, ulus, oymaq, el ağlar.* M.V.Vidadi. *..Rəşidin bu insanlığını və hümmətini hər kəs bildi.* İ.Musabəyov; 2) naməlum, qeyri-müəyyən adam, kim olur olsun. *Hər kimdir, qoy içəri gəlsin.* – [Sərvər:] *Onda qızı hər kəsə istəyirsən, ver!* Ü.Hacıbəyov. **Hər ləhzə** – b a x **hər an**. *Gəh təmənna tiğin eylərsən, gəhi peykanını; Yerdən hər ləhzə bir ehsanə eylərsən həvəs.* S.Ə.Şirvani. **Hər nə** – hər şey, nə varsa. *Hər nə olursa. Hər nə istəsə, ver. Hər nə desə, qulaq as. Onun əlindən hər iş gələr. – Hər nəyimiz varsa, qurbandır sənə; Yaz gələr, atını minərsən yenə.* H.K.Sanılı. [Minnət xanım:] *Onu da yadında saxlarsan, sonra hər nə lazımdır, mən sənə deyərəm.* Ü.Hacıbəyov. **Hər nəfər** – b a x **hər kəs**. [Şah:] *Peşə ilə hər nəfər öz işlərin saz eylər.* Ü.Hacıbəyov. **Hər saat** – b a x **hər vaxt**. *Hər saat hazır olmaq.* **Hər şey** – bütün, hamı, nə varsa hamısı. *Hər şeyi açıb demək. Hər şeydən əlini üzmək. – Hər şey gözəlləşmədə; Sən də gözəlləş; Bu həyat kimi.* M.Müşfiq. *Hər şey dərin bir sükut içində sahibinə baxıb, sanki soruşurdu.* Mir Cəlal. **Hər tərəf** – bütün ətraf, ətrafdakı yerlər. *Hər tərəfdə yağış yağır. Hər tərəfdən musiqi səsi eşidilir. – Telli həyatin hər tərəfinə göz gəzdirdi.* S.Hüseyn. *Hər tərəfdə sükut çökəndə gəmi mexanizmlərinin uğultusu eşidildi.* M.Hüseyn. **Hər vaxt** – həmişə, hər zaman. *Hər vaxt qapımız üzünüzə açıqdır. Hər vaxt istəsəniz, gələ bilərsiniz.* **Hər yan** – hər tərəf, ətraf. *Hər yan qarla örtülmüşdü. Hər yan qaranlıq idi.* – [İsmət:] *Açılmış hər yanda güllər, çiçəklər; Qızlar, oğlanlar sevinər, seyr edər.* H.Cavid. [Mərcan bəy:] *Səsin düşüb hər yana; Çığırırsan, ay arvad.* Ü.Hacıbəyov. **Hər zaman** – b a x **hər vaxt**. *Hər zaman bunları gözüm görəndə; Köhnə yaram olur təzə dünyadə.* Aşıq Ələsgər. *Mən çox istərdim ki, sənin hər zaman; Örtməsin o dilbər hüsnünü duman.* S.Vurğun.

2. Həmcins üzvlü cümlələrdə bölgü bildirir. [Abbas:] *Qovma dərgahından şirin nökəri; Geymərəm hər şalı, hər qələmkari.* "Abbas və Gülgəz". *Bu xəbər hər yana, hər yerə, hər səmtə yayılır və çatırdı.* S.Rəhimov.

◊ **Hər addımda (addımbaşı)** – daim, tez-tez. *Hər addımda çətinliklə üzləşmək. – Öz kökünü bilməyən gözü küllü bu millət; Zamanın yollarında hər addımda yanıldı.* M.Müşfiq. **Hər ağızdan bir avaz (səs) gəlir (çıxır)** – bir işdə ümumi rəyin, yekdilliyin olmadığını bildirir. [Kazım:] *Qoyurlar ki, adam bir şirin yuxu yata?! Gecə yarıyacan baş-beynimizi aparırlar. Hər ağızdan bir avaz gəlir.* İ.Şıxlı. **Hər bir ehtimala qarşı** – ehtiyac xatirinə, ehtiyac olduqda, lazım gəldikdə, ola biləcək bir iş xatirinə. [Fəxrəddin] *hər ehtimala qarşı ehtiyat edərək, qapıdan çox uzaqda durmuşdu.* M.S.Ordubadi. **Hər bir kəlamı (sözü) qızıldır** – çox ağıllı, dəyərli, parlaq danışıq haqqında. *Dünyagörmüş qocanın hər kəlamı* (*sözü*) *bir qızıldır.* **Hər biri bir oğula dəyər** – çox qiymətlidir, misli-bərabəri yoxdur, çox gözəldir. *Bu ağacların hər biri bir oğula dəyər.* **Hər gördüyündən göz kirəsi istəmək** – gördüyü, rast gəldiyi

adamdan bir şey almayınca əl çəkməmək. **Hər halda** – 1) ehtimal bildirir – yəqin, nə olursa olsun. *Hər halda bu gün gələcək.* – [Ceyran:] *Hər halda yenə görüşə bilərik.* S.Hüseyn. *Hər halda yazdığım acı həqiqət; Balaca bir qızın böyük dərdidir.* M.Rahim; 2) nə kimi vəziyyət olur olsun, nə olursa olsun, mütləq. *Hər halda gəlməlisən.* – *Axund Fərəc hər halda camaatı ağlatmalı idi.* Qantəmir. [Üçüncü əyan:] *Mənim fikrimcə, hər halda vəliəhdi paytaxta çağırmaq lazımdır, yoxsa sonra gec olar.* Ü.Hacıbəyov. **Hər hansı bir** – qeyri-müəyyənlik bildirir. *Hər hansı bir şəxs. Hər hansı bir iş.* – [Nüsrətəddin:] *Azərbaycan xalqı Toğrul ilə hər hansı bir məsələ üzərində müzakirə aparmaq üçün məni vəkil etməmişdir.* M.S.Ordubadi. **Hər işə (şeyə) qulp qoyur** – işləməyə mane olur. *Hər şeyə qulp qoymaq onun köhnə adətidir.* **Hər kol dibindən çıxan** – b a x **hər yerindən duran**. *Hər kol dibindən çıxan özünü rəis sayır.* **Hər necə çalsa(lar), elə (eləcə) də oynamaq** – öz müstəqil fikri olmayıb başqasının sözü ilə iş görmək. *Müstəqil fikri yoxdur, hər necə çalsalar, elə də oynayır.* **Hər nə isə** – söhbəti, söylənilən fikri yekunlaşdırmaq üçün işlənir; nə isə. *Gecə şehmi düşmüş, xırdaca yağışmı yağmışdı, hər nə isə...* M.Rzaquluzadə. **Hər nə qədər (olsa)** – necə olsa, hər halda. *Hər nə qədər olsa əməkdaşımızdır, kömək etmək lazımdır.* – *Yer üzündə hər nə qədər insan yaşar; Yer üzündə o qədər də şeytan yaşar.* M.Araz. **Hər nə olur(sa) olsun** – hər halda, necə olur olsun, mütləq. *Hər nə olur olsun, kitab sahibinə qaytarılmalıdır. Hər nə olur olsun, getməliyəm.* **Hər şeydən əvvəl** – ilk növbədə, ilk öncə; ən ümdəsi (bir şeyin əhəmiyyətini gücləndirir). *Hər şeydən əvvəl, biz dostuq. Hər şeydən əvvəl, ədalətli olmaq lazımdır.* **Hər şeyi söz eləmək** – hər boş şeyə diqqət vermək, ondan məna çıxarmaq. *Hər şeyi söz eləyib dava salmaq.* **Hər tükü bir qızıl** *zar.* – çox tərif məqamında işlənir. *Qoyunumun hər tükü bir qızıldır.* **Hər vəchlə** – hər vasitə ilə, hər necə olur olsun, hər halda. *Müxtəsər, hər vəchlə məşrutə min nöqsandadır..* M.Ə.Sabir. **Hər yerindən duran; hər yetən (çatan); hər yoldan (küçədən) ötən (keçən)** – başqası haqqında saymazyana işlədilən ifadə. *Hər yerindən duran şair olub. Hər yoldan ötən göstəriş verir.* – [Qərib:] *Qayıtmasam, qınar məni hər yetən; Getdim, yar, əyləndim, bəlkə gəlmədim.* "Aşıq Qərib". [Əminə:] *Hər çatan rüşvət verib canını qurtarmadımı?* Ə.Əbülhəsən. **Hər yolla** – hər necə olursa olsun, bütün vasitələrlə. [Əyanlar:] *Hər yolla çalışırdılar ki, mollanı Teymurun gözündən salsınlar.* "M.N.lətif."

**HƏRAMİ** *is.* [*ər.*] Quldur, çapovulçu, yolkəsən. *Oğru ol, hərami ol, doğruluğu əldən buraxma.* (Ata. sözü). *Həramilər Bakıya bulud kimi dolanda; Biz köməksiz qalanda; Sən hardaydın, de harda, ey Vətənin övladı?* B.Vahabzadə. *Həramilərə qalsın qara, qorxulu yollar; Mənə günəş batınca ulduz verin, ay verin!* M.Müşfiq.

**HƏRAMİLİK** *is.* Quldurluq, çapovul(çuluq), yolkəsmə.

**HƏRARƏT** *is.* [*ər.*] 1. İstilik. *Havanın hərarəti. Sobanın hərarəti.* – *Payızın ilk günləri idi. Günəşin şüaları qüvvədən düşmüş və yayda saçdığı hərarəti verməkdən aciz idi.* T.Ş.Simurq. *Bahar günəşinin hərarəti tək; Xəyalım dünyanı salama gəlir.* S.Vurğun. // İnsan bədəninin istilik dərəcəsi (səhhətin göstəricisi kimi); qızdırma. *Xəstənin hərarətini ölçmək. Uşağın hərarəti var.* – *Yasəmənin qızdırması getdikcə artırdı. Səhər açıldıqda hərarəti 40 dərəcəyə çatdı.* S.S.Axundov.

2. *məc.* Mehribanlıq, səmimiyyət; səmimi, xoş hisslər, xoş münasibət. *Dedim, iki anam vardır, qoy var olsun bu həqiqət; Onlarındır şerimdəki bu məhəbbət, bu hərarət.* S.Rüstəm. *Həbib Gözəlin evində hərarət, körpələrində ünsiyyət, özündə mərhəmət gördüyü kimi, Gözəl də Həbibdə insaniyyət, mehribanlıq hiss edirdi.* Ə.Vəliyev.

3. *is.* **Hərarətlə** şəklində *zərf* – mehribanlıqla, səmimiyyətlə, xoş hisslərlə, xeyirxahcasına, coşqunluqla. *Hərarətlə görüşmək.* – *Qadın qollarını açıb, Tahirin boynunu hərarətlə qucaqladı.* M.Hüseyn. *Gəlirim bu olub ki, neçə insan əlini; gözlərinə dik baxıb; hərarətlə sıxmışam.* R.Rza.

// *məc.* Coşqunluqla, qızğınlıqla, ehtirasla. *Ortada bir nəfər dayanıb çox hərarətlə danışırdı.* S.Rəhman.

**HƏRARƏTKEÇİRMƏ** bax **istilikkeçirmə**. *Metalın hərarətkeçirmə xassəsi.*

**HƏRARƏTLİ** *sif.* 1. İsti, qızmar, yandırıcı. *Hərarətli günəş. Hərarətli soba. – Çıxarır zahirə şöhrətli Ural qatlarını; Rəngbərəng, canlı, hərarətli metal qatlarını.* M.Müşfiq.

2. Hərarəti, istisi olan; qızdırmalı.

3. *məc.* Qızğın, atəşin, alovlu, ehtiraslı, coşqun. *Hərarətli nitq. Hərarətli salamlar.* – [Yaşlı kişi:] *Mən* [Şirinnazı] *bir zaman nə qədər də hərarətli bir məhəbbətlə sevib əzizləmişdim.* S.Hüseyn. *Güllə səsi Xəlili hərarətli, işıqlı aləmdən ayırıb, yovşanlı, şoran düzə qaytardı.* İ.Məlikzadə.

**HƏRARƏTÖLÇƏN** bax **termometr**. *Hərarətölçənlə qızdırmanı ölçmək. – Həkim qız hərarətölçəni Heybətə verdi.* M.Hüseyn.

**HƏRAYLIQ** *sif.* Hər ayda alınan (verilən), hər ayda görülən (görülməli olan), hər ay üçün nəzərdə tutulan. *Həraylıq maaş. Həraylıq plan. Həraylıq xərc.*

**HƏRB** *is.* [*ər.*] Müharibə, döyüş, savaş. *Dünya hərbi. – O təmiz alnında gördüyüm vüqar; Vətəndaş hərbindən qalmış yadigar.* S.Vurğun. *Xəyalın qanadı yenə yüksəlir; Yadıma qanlı hərb illəri gəlir.* N.Rəfibəyli. ◻ **Hərb etmək** – müharibə etmək. [Birinci işçi:] *Hərb edib çarpışırıq sizlər üçün! Çalışıb çarpışırıq sizlər üçün!* H.Cavid.

**HƏRBCU** *is.* [*ər.* hərb və *fars.* ...cu] *köhn.* Dava etməyi, vuruşmağı sevən; dava axtaran, müharibə axtaran.

**HƏRBÇİ** *is.* 1. Hərbi xidmətdə olan adam, hərbi xidmətçi; hərbiyyəli. *Hərbçilərin təlimi. – Ucqar stansiyalarda .. silahlı hərbçilərə rast gəlmək olur.* Ə.Əbülhəsən. *Köhnə hərbçi Yusif başının üstündən uzanıb çəkilən işığı görcək Daşdəmiri tələsdirdi..* B.Bayramov.

2. Silahlanma və müharibəyə hazırlaşma siyasəti yeridən adam; militarist. *İmperializm hərbçiləri.*

**HƏRBÇİLİK** *is.* 1. Hər hansı dövlətin yeritdiyi silahlanma və müharibəyə hazırlaşma siyasəti. // Bir ölkədə hərbçilərin siyasi ağalığı və ölkənin bütün təsərrüfatının qəsbkar müharibə məqsədlərinə tabe edilməsi; militarizm.

**HƏRBƏ** *is.* [*ər.*] *köhn.* 1. Qısa süngü, balaca nizə.

2. Hədə-qorxu, hərbə-zorba. *Yağı düşmənin hərbəsi; Qaçırtmaz meydandan məni.* "Koroğlu". ◻ **Hərbə gəlmək** – bax **hərbələmək**. [Camal bəy:] *Mən sizə qaraqoyunlu deyiləm, mənə hərbə gələsiniz..* N.Vəzirov.

**HƏRBƏLƏMƏ** "Hərbələmək"dən *f.is.*

**HƏRBƏLƏMƏK** *f.* Qorxutmaq, hədə-qorxu gəlmək, hərbə-zorba gəlmək. *İstədim, yaxın gedəm; Yoldaşları hərbələdi.* Aşıq Ələsgər. *Birdən Bülənd .. başını yuxarı qaldırıb uzaqdan-uzağa qardaşını hərbələyərək yumruğunu havada salladı.* Ə.Əbülhəsən.

**HƏRBƏ-ZORBA** *is.* Qorxutmaq, dəhşətə salmaq üçün edilən hərəkət və ya deyilən söz; hədə-qorxu, hədə. ◻ **Hərbə-zorba gəlmək** – bax **hərbələmək**. *Əsil deyişmə odur ki, bir məclisdə iki aşıq* (*şair*) *qarşı-qarşıya eyni rədif, eyni qafiyə və eyni şəkildə bədahətən şeir söyləsin, bir-birinə hərbə-zorba gəlsin, qıfılbənd desin, müvafiq cavab alsın.*

**HƏRBİ** *sif.* [*ər.*] 1. Hərbə, müharibəyə aid olan, müharibə ilə əlaqədar olan. *Hərbi vəziyyət. – Öz əlinlə öz yurduna ölüm dartmaq! Bu "yeni" bir hərbi məntiq!* M.Araz. // Müharibə ehtiyacları üçün olan. *Hərbi zavod. Hərbi sənaye. – Gurlayır dalbadal hərbi gəmilər; Soruşur parolu Hüseyndən şəhər.* M.Rahim. *Şəhərdə bütün əhalini ayağa qaldırmaq, düşmənin hərbi sursat və avadanlıq aparmasına yol verməmək lazım idi.* S.Vəliyev.

2. Orduya aid olan, orduda xidmətlə əlaqədar olan; əsgəri. *Hərbi həkim. Hərbi məktəb. Hərbi xidmət. Hərbi mükəlləfiyyət.*

3. Orduda xidmət edən adamla əlaqədar olan; əsgəri. *Hərbi and.* // Hərbi xidmətçiyə aid; əsgəri. *Hərbi forma* (*geyim*). – *Bir dəfə istirahət günü hərbi libası dəyişib sivil libas geyərkən* [Zərqələm] *məni tanımadı.* Ə.Sadıq.

4. Orduda xidmət edən; hərbçi, hərbiyyəli. *Hərbi adam.*

**HƏRBİLƏŞDİRİLMƏ** "Hərbiləşdirilmək"dən *f.is. Nəqliyyatın hərbiləşdirilməsi.*

**HƏRBİLƏŞDİRİLMƏK** *məch.* Hərbi ehtiyaclara, hərbi tələbata, hərbi vəziyyətə

uyğunlaşdırılmaq. *Dəniz nəqliyyatı hərbiləşdirildi.*

**HƏRBİLƏŞDİRMƏ** "Hərbiləşdirmək"-dən *f.is.*

**HƏRBİLƏŞDİRMƏK** *f.* Hərbi vəziyyətə, müharibə şəraitinə, hərbi ehtiyac və tələbata uyğunlaşdırmaq. *İqtisadiyyatı hərbiləşdirmək.* // Əhaliyə müharibə işini öyrətmək.

**HƏRBİLƏŞMƏ** "Hərbiləşmək"dən *f.is.*

**HƏRBİLƏŞMƏK** *f.* Hərbi vəziyyətə, hərbi ehtiyac və tələbata uyğunlaşmaq, hərbi ehtiyaclara xidmətə keçmək.

**HƏRBİYYƏ** *is.* [*ər.*] *köhn.* 1. Hərbi və əsgəri işlərə baxan dövlət idarəsi.

2. Hərbi. *Cuma İmanzadə 1922-ci ildə Bakıda hərbiyyə məktəbini bitirmişdi.* Ə.Əbülhəsən. [Ağagül Ağalarova:] *Mən hərbiyyə nazirinə təcili raport gətirmişəm, ata!* Ə.Məmmədxanlı.

**HƏRBİYYƏLİ** *is.* Hərbi xidmətçi, əsgəri xidmətdə olan adam. *Üstüörtülü bir dam tapıb içəri girəndə hərbiyyəlilərlə dolu olduğunu gördü.* Mir Cəlal.

**HƏRCAYİ** *sif.* [*fars.*] 1. Avara, sərsəri, veyil, heç bir işlə məşğul olmayan. *Hərcayi adam.* – *Ələsgərəm, doğru yoldan azmaram; Hərcayi gözələ tərif yazmaram.* Aşıq Ələsgər. *Şəhərlərdə müxtəlif hərcayi və macəracu ünsürlərin baş qaldırıb, talanlar yaratmaq qorxusu yaranmışdı.* M.İbrahimov. // *Zərf mənasında.* Boş-boş, avara-avara, veyil-veyil. *Vəqt oldu çıxıb küçədə cövlan edəsiz siz; Hərcayi gəzib, hər yeri seyran edəsiz siz.* M.Ə.Sabir. // İs. mənasında. *Hərcayidən, müxənnəsdən, nadandan; Nə söz qaldı sənətkara dəyməmiş?* Aşıq Ələsgər. *Hiyləgər, hərcayi, yaltaq, tamahkar; Xalq içində, dost yanında olar xar..* Aşıq Hüseyn.

2. Mənasız, boş. *Hərcayi iş.* – [Hacı:] *Hərcayi söz danışırsan!* M.İbrahimov. *İçəridən .. zarafatlaşan cavanların hərcayi sözləri eşidilirdi.* İ.Hüseynov.

**HƏRCƏHƏTLİ** bax **hərtərəfli**. *Hərcəhətli inkişaf etmiş gənc. Hərcəhətli irəliləyiş. Hərcəhətli üstünlük açıq-aydın görünməkdədir. Kənd təsərrüfatının hərcəhətli inkişafı. Məsələni hərcəhətli yoxlamaq lazımdır.*

**HƏRC-MƏRCLİK** *is.* Əmin-amanlıq, qayda-qanun olmadığı vəziyyət; qarışıqlıq, nizamsızlıq, qarmaqarışıqlıq; anarxiya. *Hərcmərclik geniş Rusiyanın bir başından tutmuş o biri başına qədər dalğalanırdı.* Çəmənzəminli. [Nizami:] *Çünki hazırkı hərc-mərcliyi doğuran başlıca səbəb Toğrulun iş başında olmasıdır.* M.S.Ordubadi.

**HƏRÇƏND** [*fars.*] Bir cümləni ona zidd olan və ya onu aydınlaşdıran başqa cümlə ilə qarşılaşdıran bağlayıcı (həmin cümlənin ikinci hissəsində *amma, ancaq, lakin, fəqət* bağlayıcılarından biri işlənir). *Hərçənd qar yağır, lakin hava soyuq deyil.* – [Uçitel] *astanada ayaqqabısını soyunaraq onun mütaliəsinin qurtarmasını gözlədi. Hərçənd, bilirdi ki, molla Qurani-Kərimi oxumaqdan daha çox vərəqlərə baxır və özünü məşğul kimi göstərir.* İ.Şıxlı.

**HƏRÇİ** *zərf* [*fars.*] Hər nə qədər, nə qədər. *Hərçi səy etdisə, bir şey çıxmadı. Hərçi çalışdısa, şeri əzbərləyə bilmədi.* – *Mirzə Səfər hərçi çalışdısa, ikinci misra gəlmədi. Neçə dəfə təpiyini yerə çırpdı, şərabın hamısını içdi, misra gəlmədi ki, gəlmədi.* Ə.Haqverdiyev. *Aslan hərçi fikir etdisə, heç bir yerə gümanı gəlməyib, naçar qardaşının başını qucaqlayıb dedi..* C.Cabbarlı.

◊ **Hərçi bada bad** [*fars.*] – nəticəsi, aqibəti, nə ilə qurtaracağı bəlli olmayan bir işə iqdam etdikdə, girişdikdə deyilən ifadə. *Molla "hərçi bada bad" deyib, girir dükana, bir tərəfdən döşənir halvanın üstünə.* "M.N.lətif." [Hamı:] *Qəm yemə, hərçi badə bad; O olmasın, bu olsun.* Ü.Hacıbəyov.

**HƏRDƏM** *zərf* [*fars.*] 1. Hər nəfəsdə, hər an, hər dəqiqə, həmişə, daim. *Söhbətində olan istər sazını; Mən çəkərəm hərdəm sənin nazını.* Sarı Aşıq. *Gözümdən seyl tək hərdəm; Axan al-qanə bir baxmaz.* Q.Zakir.

2. Bəzən, hərdən, arabir, hərdənbir, gahgah. *Hərdəm bizə də gəl.* – [Asya:] *Bu yazıq yarına hərdəm; Bir nəzər sal, gözəlim.* Ü.Hacıbəyov. *Anası hərdəm cib aynasını* [İzzətin] *ağzına tutur, nəfəsi gəldiyini seçirdi.* Mir Cəlal.

**HƏRDƏMXƏYAL** *sif.* [*fars.* hərdəm və *ər.* xəyal] Sabit fikri olmayan, tez-tez fikrini dəyişən. *Hərdəmxəyal adam.* – *Yox, Mehriban yüngültəbiətli, hərdəmxəyal qızlara bənzəmirdi.* H.Seyidbəyli. // İs. mənasında.

[Xəlil Salmana:] *Bu əhvalatı bilirəm. Mir Cəlal bir az hərdəmxəyaldır.* Çəmənzəminli. *Lətifə nə üçün hərdəmxəyal olsun?* M.Hüseyn.

**HƏRDƏN, HƏRDƏNBİR** *zərf* Həmişə deyil, bəzən, arabir. *Hərdənbir yağış yağır. Hərdənbir hava soyuyur. – Bibin hərdən çatılmış gördümü qaşlarını; Sənə şirin dil töküb oxşardı saçlarını.* S.Rüstəm. *Laçıntək qıy vurur hərdənbir Osman; Çırpınır meşələr, çalxanır duman.* H.K.Sanılı.

**HƏRƏ** *əvəz.* Toplu halında olan adamlardan hər biri; hər kəs. *Hərə bir söz deyir. Hərə bir tərəfə getdi. Hərənin öz fikri var. – Qayadibi kəndinin əhalisi durub hərə öz işinə getdi..* S.S.Axundov. *Hərə bir iş görürdü: bir yanda xəmir yoğrulur, bir yanda yumurta çalınır, bu biri tərəfdə sabah xörəyi üçün düyü arıdılırdı.* T.Ş.Simurq. *Çəkdi bu milləti hərə bir yerə; Məqsəd – kürsü eşqi, amal – mənfəət.* B.Vahabzadə. // **Hərəsi** şəklində – ayrı-ayrılıqda, hər biri. *Adamların hərəsi bir işlə məşğuldur. – Paşanın adamları da hərəsi bir tərəfdə qərar tutdular.* "Koroğlu". *Sarı bülbüllər, toraǧaylar, göyçə qarğalar, .. ənlikli bülbüllər hərəsi bir cür səslə oxuyub, səs-səsə verirlər.* E.Sultanov. *Külək qalxmışdı. Hərəsi bir rəngdə, hərəsi bir biçimdə olan yarpaqlar xışıldaşırdı.* B.Bayramov.

◊ **Hərə bir zurna çalır** – b a x **hər ağızdan bir avaz gəlir** ("**hər**"də). **Hərə öz atını minib istədiyi yerə çapır** – bir işdə birlik, həmrəylik, yekdillik olmadığını ifadə edir. **Hərənin ağzından bir avaz (hava) gəlir (çıxır)** – b a x **hər ağızdan bir avaz gəlir (çıxır)** ("**hər**"də).

**HƏRƏKAT** *is.* [*ər.* "hərəkət" söz. cəmi] 1. Müəyyən məqsəd güdən ictimai fəaliyyət. *Fəhlə hərəkatı. Sülh tərəfdarları hərəkatı. Milli azadlıq hərəkatı.* – [Firidunun] *Pişəvəri ilə olan ikinci görüşü yadına düşdü. Onlar Azərbaycanda demokratik hərəkat haqqında uzun-uzadı danışmışdılar.* M.İbrahimov.

2. Hərəkat qaydaları. *Küçə hərəkatı. Yol hərəkatı.*

**HƏRƏKƏ** *is.* [*ər.*] *dilç.* Ərəb əlifbasında saitləri necə oxumaq lazım gəldiyini göstərmək üçün hərflərin üstünə və ya altına qoyulan diakritik işarə.

**HƏRƏKƏLƏMƏ** "Hərəkələmək"dən *f.is.*

**HƏRƏKƏLƏMƏK** *f. dilç.* Ərəb əlifbası ilə yazılmış sözdə saitləri necə oxumaq lazım gəldiyini göstərmək üçün hərflərin üstünə və ya altına hərəkə qoymaq.

**HƏRƏKƏSİZ** *sif. dilç.* Hərəkəsi olmayan, hərəkə ilə oxunmayan.

**HƏRƏKƏT** *is.* [*ər.*] 1. Bir şeyin və ya onun hissələrinin sabit bir nöqtəyə görə öz yerini və ya vəziyyətini dəyişməsi; hərəkətsizliyin, sükunətin ziddi olan vəziyyət. *Ritmik hərəkət. Dairəvi hərəkət. – Cismin hərəkəti onun hissələrinin hərəkətilə təyin olunur.* "Nəzəri mexanikanın əsasları".

2. *fəls.* Materiyanın varlıq forması, onun ayrılmaz xassəsi; maddi aləmin fasiləsiz dəyişmə və inkişaf prosesi. – *Milyon il, milyard il bir yol, bir cığır; Nə geriyə dönür; nə sona çıxır; Hərəkət əbədi; Sürət əbədi.* M.Araz.

3. Yola düşmə, hər hansı bir istiqamətə getmə; yürüş. "*Yaşasın!*" *bağırtısı; Qopunca hər bir yandan; Hərəkət əmri verdi; Lələkli baş komandan.* Ə.Cavad. *Paroxodun hərəkətinə yarım saat qalmış* [Sarıköynəyi] *evdən alıb iskələyə gətirdim.* S.Hüseyn. □ **Hərəkət etmək** – 1) yola düşmək, hərəkətə başlamaq. *Qatar saat 3-də hərəkət edir. – Bağdaddan hərəkət etdiyiniz zaman Həmədana getməyin məsləhət deyil, şəhərin iki fərsəngliyində olan Köşki-baği-müəzzəmdə qalmalısan.* M.S.Ordubadi; 2) getməyə başlamaq, yerimək, yerindən tərpənmək. *..Ağlamaqlıqnan və sızıldamaqlıqnan oğlan bərk-bərk ulağın quyruğundan yapışıb qoymur heyvan hərəkət eləsin.* C.Məmmədquluzadə. *İrəli hərəkət etmək mümkün deyildi.* M.S.Ordubadi. // Hər hansı nəqliyyat növünün işi. *Qatarların hərəkət cədvəli.* // Müxtəlif istiqamətlərdə (küçələrdə, yollarda və s.-də) piyada və ya miniklə gedib-gəlmə; gediş-gəliş. *Küçədə hərəkət azalır. – Çoxaldı get-gedə, artdı hərəkət; Artıq keçinmişdi gecənin qəlbi.* S.Vurğun. *Yürüşçülərin keçəcəkləri küçələrdə hərəkət dayandırılmışdı.* H.Seyidbəyli. □ **Hərəkət etmək (eləmək)** – getmək, gəlmək, gedib-gəlmək. *Xidmətçilər əcələ ilə o tərəf-bu tərəfə hərəkət edirdilər.* M.İbrahimov.

4. İş, əməl, davranış. *Başlı-başına hərəkət. Nalayiq hərəkət. Gözəl hərəkət.* – [Şərifzadə] *Mehribanı boşadığı üçün olduqca darılmış,* [Zeynalın] *belə yersiz hərəkətindən dolayı acıqlanmışdı.* S.Hüseyn. *Teymur Cahangirovun hərəkətlərindəki məntiqsizliyi qabarıq surətdə təhlil edib dedi.* H.Seyidbəyli.

5. *hərb.* Əməliyyat. *Düşmənin hərəkətini dayandırmaq. Hərəkət planı. Cəbhədə hərəkət sahəsi.*

6. *məc.* Kəmiyyət və ya keyfiyyətcə dəyişiklik; irəliləmə, irəliləyiş, inkişaf, canlanma. *İşdə irəliyə doğru böyük hərəkət var.* – *Min gecəni neylirəm; Mənə hərəkət dolu; Min səsli, min duyğulu; Təkcə bir gündüz verin!* B.Vahabzadə.

7. **Hərəkətlə** şəklində *zərf* – hərəkət edərək. *Qaraş qəti hərəkətlə ayağa durdu.* M.İbrahimov. *Süsən birdən ayaq saxlayıb, sərt bir hərəkətlə üzünü Rəşidə sarı çevirdi.* M.Hüseyn.

◊ **Hərəkət etmək** *məc.* – davranmaq. *Hatəm xanın ortancıl oğlu Aqil də böyük qardaşı Adil kimi hərəkət edirdi.* S.Rəhimov. *Necə hərəkət edəcəyini ürəyində ölçüb-biçən Baxış bəy ata bir şallaq vurdu.* Ə.Abasov. **Hərəkət ordusu** – ordunun, müharibə vaxtı cəbhədə vuruşan hissəsi. **Hərəkətdən düşmək** – daha hərəkət edə bilməmək, işdən qalmaq, hərəkət etmək qabiliyyətini itirmək. *Əlləri hərəkətdən düşmək.* – [Sürəyya] *hələ ayaq açıb yeriməyə başlamamış, rütubətli, qaranlıq bir zirzəmidə şikəst olmuş, ayaqları hərəkətdən düşmüşdü.* Ə.Məmmədxanlı. **Hərəkətə gəlmək** – müəyyən iş görmək, fəaliyyətə başlamaq, fəaliyyət göstərmək, ayağa qalxmaq. *Oğruları tutmaq üçün inzibati orqanlar hərəkətə gəldilər.* – *Bütün kənd hərəkətə gəldi.* Ə.Məmmədxanlı. *Avtomobil müfəttişliyi hərəkətə gəldi.* H.Seyidbəyli. **Hərəkətə gətirmək** – 1) işlətmək, idarə etmək, işə salmaq. *Ekskavatoru hərəkətə gətirməyi öyrənmək.* – *Gənclər maşınla bərabər bu mürəkkəb mexanizmi hərəkətə gətirən cavan oğlanı da diqqətlə seyr edirdilər.* Ə.Sadıq; 2) dilə tutaraq, yaxud başa salaraq birinə bir işi gördürmək, şövqləndirmək. *Uşaqları hərəkətə gətirmək.* – [Nəcəf:] *Rüstəm dayı, arxayın ol, gənclər "Yeni həyat"ın adını batırmazlar. Sən qocaları hərəkətə gətir.* M.İbrahimov.

**HƏRƏKƏTEDİCİ** *sif.* Hərəkət edən, hərəkətdə olan, işləyən. *Avtomobilin hərəkətedici hissələri. Refleksin əmələ gəlməsində iki neyron – hissedici və hərəkətedici neyronlar iştirak edir.* – *Sulu məhlullarda, ərintilərdə daim sərbəst hərəkət edən ionlar öz enerjilərinin bir hissəsini itirərək az hərəkətedici, daha sabit maddəyə çevrilir.* M.Qaşqay.

**HƏRƏKƏTLİ** *sif.* 1. Hərəkət edən, dayanmaz, qərarsız, mütəhərrik. *Maşının hərəkətli hissələri.*

2. *məc.* Çox hərəkət edən, qərar tapmayan; diri, diribaş, qıvraq. [Rüstəm:] *Necə xanımlar: şəhbaz baxışlı, ahu gözlü, şirin hərəkətli, şəhd sözlü! Sən də deyirsən dünya görürəm?* Ə.Haqverdiyev.

**HƏRƏKƏTÖTÜRÜCÜ** *sif. xüs.* Hərəkəti bir yerdən başqa yerə ötürən. *Hərəkətötürücü dişli çarx. Hərəkətötürücü qayış.*

**HƏRƏKƏTSİZ** *sif.* 1. Hərəkət etməyən, tərpənməz halda olan, qımıldanmayan. *Yayın orta aylarında gün otları yandırır; Hərəkətsiz o təbiət məzarlığı andırır.* S.Vurğun. *İşıq titrədikcə* [Qaragünənin] *qaya parçası kimi hərəkətsiz üzündə əcaib kölgələr oynaşır, .. sonra yenə donub qayaya dönürdü.* M.Rzaquluzadə. // Zərf mənasında. *Xəstə hərəkətsiz uzanmışdı.* – *Rüstəmbəy otağına girdikdə lampanı yandırmadı, .. otağın ortasında hərəkətsiz durdu.* Çəmənzəminli. *Ceyran xanım əli qoynunda, hərəkətsiz dayanaraq baxırdı.* M.Hüseyn.

2. *məc.* Ağır, ağırtərpənən, ləng. *..Turac da kol topasında; hərəkətsiz qalıb.* R.Rza. *Benzin olmazsa bizim divlərimiz; Qalacaqdır hərəkətsiz, səssiz.* M.Müşfiq.

**HƏRƏKƏTSİZLİK** *is.* 1. Hərəkət olmadığı hal, vəziyyət, tərpənməzlik. *Cismin hərəkətdə olması və hərəkətsizliyi bir-birinə əks olan iki haldır.* – *Hərəkətsizlikdən bədəni həm dözülməz dərəcədə üşüyür, həm də gizildəyirdi.* M.Rzaquluzadə.

2. *məc.* Ləngllik, ağırlıq, tənbəllik, ətalət. *İndi* [ova getdikdə] *Axtarı* [tənbəl tulanı] *tanımaq olmurdu. Tənbəllik necə olmuşdu? Hərəkətsizlik harada qalmışdı.* S.S.Axundov.

**HƏRƏKƏTVERİCİ** *sif.* 1. Aparıcı, yönəldici, istiqamətverici; əsas, baş. – *Vətənpərvərlik quruluşumuzun hərəkətverici qüvvəsidir.*

2. *tex.* Hərəkətə gətirən, hərəkəti idarə edən. *Hərəkətverici çarx. – Ekskavatorun bütün hərəkətverici dəstəkləri* [gəncin] *əlindədir.* M.Əlizadə.

**HƏRƏM** *is.* [*ər.*] *köhn.* 1. Arvad, zövcə. [Çopo:] *Qəbir torpaqla örtülmədən əvvəl xaqan, onun hərəmi və dayə gəldi.* Çəmənzəminli. [Həsən:] *Ah .. mənim hərəmim. Qardaşlar, niyə gözləyirsiniz, bu qədər zülmə dayanmaqmı olar? Zor ilə mənim hərəmimi aldılar, apardılar.* C.Cabbarlı.

2. Hərəmxana qadınlarından hər biri. *Hərəmxanada cümlə hərəmlər şahın fərmayişi ilə otağa hazır olub müntəzir idilər.* M.F.Axundzadə. [2-ci məhbus:] *..Şah Abbas öz sarayında gözəl-göyçək hərəmləri ilə eyş-işrətlə məşğuldur.* Ü.Hacıbəyov.

3. B a x **hərəmxana**. // Keçmişdə müsəlman evlərində qadınlara məxsus hissə, otaqlar.

**HƏRƏMAĞASI, HƏRƏMBAŞI** *is. köhn.* Hərəmxanada xidmət edən, oraya girib-çıxmağa ixtiyarı olan saray xidmətçisi. [Cavan] *hərəmbaşının rəyinin ziddinə olaraq, saraydakı qulluqçu qızlardan biri ilə sevişmişdi.* P.Makulu.

**HƏRƏMXANA** *is.* [*ər.* hərəm və *fars.* ...xanə] *köhn.* Sarayda hərəmlərin (2-ci mənada) yaşadığı otaqlar, bina. *Şah Səlməxatuna işarə etdi ki, hərəmxanaya getsin və xacəyə buyurdu ki*: – *Mirzə Sədrəddini çağır, gəlsin.* M.F.Axundzadə. *..Əbdülhəmidin hərəmxanasında dörd yüzədək övrət və qız var imiş.* C.Məmmədquluzadə.

**HƏRF** *is.* [*ər.*] 1. Hər hansı bir dilin əlifbasında adətən müəyyən səsə uyğun gələn yazı işarəsi; əlifbanı təşkil edən işarələrdən hər biri. "*B*" *hərfi. Kiçik hərf. – İsmin üç hərf ilə eylərəm aşkar; Biri "kaf"dı, biri "lam"dı, biri – "sad".* Aşıq Ələsgər.

2. *məc.* Bir şeyin mənasının, məzmununun əksinə olaraq onun xarici, formal cəhəti. *Tərcümədə mətnin hərfini deyil, ruhunu verməyə çalışmaq lazımdır.*

3. Söz, kəlam, kəlmə. *Xoşuna getməyir şair könlümün; Onun hər yalançı hərfi, ey qadın!* S.Rüstəm.

**HƏRFBƏHƏRF** *zərf* [*ər.* hərf və *fars.* bə] Hərfi-hərfinə, hərfiyyən, əslindəki kimi, eynən, hərf-hərf. *Hərfbəhərf köçürmək. Hərfbəhərf diktə etmək. Hərfbəhərf tərcümə etmək. – Yazılsa nöqtəbənöqtə, deyilsə hərfbəhərf; Qutarmaz həşrə qədər halü-macərası gülün.* X.Natəvan.

**HƏRF-HƏRF** *zərf* [*ər.*] Hərflərlə, hər hərfi ayrıca olaraq. *Hərf-hərf diktə etmək. – Yusif köhnə əlifba ilə yazdığı adını hərf-hərf oxudu.* B.Bayramov.

**HƏRFİ** *sif.* [*ər.*] Hərfi-hərfinə, hərfbəhərf. ☐ **Hərfi tərcümə** – cümlədəki sözləri olduğu kimi bir dildən başqa dilə çevirməkdən ibarət olan tərcümə. *Hərfi tərcümə dilin qayda-qanunlarını pozur. Hərfi tərcümə ən yanlış tərcümədir.*

**HƏRFİ-HƏRFİNƏ** *zərf* Heç bir şey artırıb-əskiltmədən, dəyişmədən, olduğu kimi, dəqiq. *Gördüklərini hərfi-hərfinə danışmaq. Hadisəni hərfi-hərfinə yazmaq. – Əjdər, Məmmədəlinin sözlərini və özünün ona verdiyi cavabları hərfi-hərfinə nağıl etdi.* S.Rəhman. [İmperator:] *Sən də cəsarət edib bir ayağı çarıqlının cızma-qarasını hərfi-hərfinə təkrar edirsən?* Ə.Məmmədxanlı.

**HƏRGAH** [*fars.*] Xəbəri felin şərt şəkli ilə ifadə olunan budaq cümləsini baş cümləyə bağlayan və şərti qüvvətləndirən bağlayıcı – əgər. *Hərgah vaxtın olsa, axşam bizə gəl.* – [Süleyman:] *Hərgah, Allah eləməmiş, Əsgər pis adam olsa idi, mən sənin qızını ona istərdimmi?* Ü.Hacıbəyov.

**HƏRGİZ** *zərf* [*fars.*] Əsla, qətiyyən, heç vaxt. [Tarverdi:] *Ağa, vallah, mən bundan əvvəl heç quldurluğa getməmişdim, dəxi bundan sonra hərgiz getmənəm.* M.F.Axundzadə. [Xan əyanlara:] *Ağalar, özünüz bilirsiniz ki, mənim hərgiz ovdan əliboş qayıtdığım olmamışdır.* Ə.Məmmədxanlı.

**HƏRGÜNKÜ** *sif.* Hər gün olan, hər gün baş verən; hər gün görülən. *Hərgünkü işdir.* – [Qızın] *üzündə hərgünkü bu təlaş dolu sualı oxumağa ana vərdiş etmişdi.* Ə.Məmmədxanlı.

**HƏRGÜNLÜK** *sif.* Hər gün işlədilən, zər gün geyilən, adi, gündəlik. *Hərgünlük paltar.*

**HƏRİ** *əd. məh.* Bəli, hə. [Qənbər:] *Həri, keçin, durmayın.* H.Nəzərli.

**HƏRİF** *is.* [*ər.*] 1. Gözə tanış gəlməyən, şübhəli görünən tip; subyekt. *Bu hərif kimdir? O hərif haradan gəldi?* – [Mehralı:] *Müxtəsər, bankdan bizim çeklərlə pul alanda həriflər qamarlayıblar.* S.Rəhman. [Yusif:] *Həriflər daşımağa macal tapmayıblar, özləri əkilsə də, çuvallar şahid qalıb..* B.Bayramov.

2. *məc.* Bic, çoxbilmiş, tez başa düşən, tez duyan, ayıq. *Yaman hərifdir.* – *Bəhram hərif olduğu üçün Qulunun bu mehribanlığına əhəmiyyət vermədi və .. bu nəvazişdən sonra əməli bir təklif olacağını gözlədi.* Çəmənzəminli. [Hacı Murad:] *Amma o da hərifdir, özünü o yerə qoymuşdu ki, guya heç bir zaddan xəbəri yoxdur.* S.S.Axundov.

3. Yüngül söyüş məqamında işlədilir. [Altunbay:] *Sən də, Toğrul, xristian hərif, yaxın gəl!* C.Cabbarlı. [Ağasəfər:] *Adə, ey .. çayqıraqlı pəzəvəng hərif! Qrammofon niyə susdu?* Ə.Əbülhəsən. // *məc.* Alçaq, yaramaz (adı çəkilməyə layiq olmayan adam haqqında). – *Nə var? – Nə oldu? – Həriflər özgə bir səngərə doldu.* S.Vurğun. *Bombatək partlaram döyüş zamanı; Bütün hərifləri edərəm zəlil.* S.Rüstəm.

4. *dan.* Oyun yoldaşı; oyundaş. *Hərif uduzdu.* – *Uşaqlardan biri o birilərinə him ilə bildirirdi ki, gələn hərif xamdır.* H.Sarabski. *Hərifin biri həmişə istər ki, aşıqlar alçı dursun, o birisi də gözünü dikib tovxanlara müntəzir olar.* Ü.Hacıbəyov.

5. *klas.* Sirdaş, yoldaş, munis. *Bildim, qəmini sənin, ki çoxdur; Qəm çəkməyə bir hərif yoxdur.* Füzuli.

6. B a x **rəqib** 2-ci mənada. *Qara pəhləvan gördü, yox, hərif çox qüvvətlidir.* "Koroğlu".

**HƏRİLKİ** *sif.* Hər il olan, hər il baş verən. *Bahar gəlmiş Bakıya; Hərilkindən daha şən.* Z.Xəlil.

**HƏRİS** *sif.* və *zərf* [*ər.*] Bir şeyə həddindən artıq can atan, ona aludə olan, onun düşkünü olan, təəşşüqü olan; gözüdoymaz, düşkün. [Bayram:] *Amma çibin şirniyə həris olan kimi Tarverdi Pərzadə harisdir..* M.F.Axundzadə. *Bazar camaatı belə pulsuz tamaşalara çox həris idi.* Mir Cəlal. ◻ **Həris olmaq** – ehtirasla sevmək; çox sevmək, istəmək. *Uşaq şirniyə həris olur. Teatr hərisi olmaq.* – *Pəri nənə İskəndərin çaya həris olduğunu bildiyi üçün his basmış qara aftafanı ocağın üstünə qoyub su qızdırdı, çay dəmləmək xəyalına düşdü.* M.Hüseyn.

**HƏRİSLƏŞMƏ** "Hərisləşmək"dən *f.is.*

**HƏRİSLƏŞMƏK** *f.* Tamahı, acgözlüyü daha da artmaq. *Hələ istismarın gündən-günə artması, sahibkarların həddindən artıq hərisləşib həyasızlaşması ən avam fəhlələrdə belə yeni duyğu yaratmışdır.* M.S.Ordubadi.

**HƏRİSLİK** *is.* 1. Bir şeyi etməyə, yaxud öyrənməyə, bilməyə göstərilən hədsiz həvəs, meyil, maraq; aludəlik. *Dükan qabağına toplaşanların əhvalatı öyrənmək hərisliyi daha da artırdı.* Mir Cəlal. *Qoşqarda hələ lap uşaqlıqdan soyuq suya bir hərislik vardı.* İ.Hüseynov.

2. **Hərisliklə** şəklində *zərf* – acgözlüklə, ehtirasla. *Hərisliklə yemək.* – *Xosrov bəy .. yenə də vəhşi bir hərisliklə Zərrintac xanıma baxır..* S.Rəhimov. [Nərgiz:] *Bütün bu hərəkətlərimdən özüm hərisliklə ləzzət çəkirdim.* B.Bayramov.

**HƏRKİ-HƏRKİLİK** *is.* Qayda-qanun, nizam-intizam olmadığı hal; özbaşınalıq, başlı-başınalıq, hərc-mərclik, qarışıqlıq. *Kasıb kəndçilər firqəyə yazılardılar, fəqət işlər hələ yaxşı bir nizama düşməmişdi, hərki-hərkilik idi.* E.Sultanov. *Hacı Əmiyə və Molla Nisəyə görə hərki-hərkilik əmələ gəlirdi, din-iman əldən gedirdi.* M.İbrahimov.

**HƏRLƏMƏ** 1. "Hərləmək"dən *f.is.*

2. *zərf* Dairəvi, dövrəvi, dövrə vuraraq. *Hərləmə durub tamaşa etmək.* – [Dəmirov və Mürşüdoğlu] *hərləmə oturub, kababın başına toplaşdılar.* S.Rəhimov. // *sif.* Çevrə şəklində olan; dairəvi, girdə. *Hərləmə taxta.* – *Qoca üstündə oturduğu yekə hərləmə daşa çəkicini vuraraq: – Alt daşın varmı? – deyə soruşdu.* S.Rəhimov.

**HƏRLƏMƏK** *f.* 1. Dairəvi şəkildə hərəkət etdirmək; fırlatmaq, dolandırmaq, hərləndirmək, aylandırmaq. *Çarxı hərləmək.* – *Gözləri sevinclə gülən bir qız və oğlan çiyin-ciyinə verərək qüvvətli əllərilə böyük bir təkəri hərləyir.* M.İbrahimov. *Cavan fəhlə cəld bir hərəkətlə əlindəki açarı quyuya endiriləcək boruya keçirərək hərlədi..* M.Hüseyn.

2. Dalını qabağa, yuxarısını aşağı və ya əksinə çevirmək; döndərmək, dolandırmaq, hərləndirmək, o tərəf-bu tərəfə çevirmək. *Buruqçu Salman kepkasını hərləyib, ona baxan gənclərə göz gəzdirir, Ağbulaq meşələrinə səs sala-sala ucadan danışaraq sözünü qurtarmaq istəyirdi..* S.Rəhimov. *Yüngül, səssiz addımlarla* [qadın] *manqalın yanına endi, arxasını gələn adama çevirib şişləri hərləməyə başladı.* İ.Hüseynov. // Havada fırlatmaq, dolandırmaq, hərləndirmək. *Qamçını hərləmək. Qumbaranı hərləyib atmaq.* – [Vaqif] *qeyri-ixtiyari olaraq əlini pəncərəyə tərəf hərləyəndə güldana toxunub saldı.* Çəmənzəminli. *Usta Əbülqasım çəkicini hərləyərək cavab verdi.* S.Rəhimov.

3. *məc.* Dalısınca düşüb izləmək, axtarmaq. *Yaranal güclü qoşun götürüb, Nəbini dağlarda hərləməyə başladı.* "Qaçaq Nəbi".

**HƏRLƏNDİRMƏ** "Hərləndirmək"dən *f.is.*

**HƏRLƏNDİRMƏK** b a x **hərləmək** 1 və 2-ci mənalarda. *Onun* [faytonçunun] *əli tərpənir, şallağı havada hərləndirirdi.* S.Rəhimov.

**HƏRLƏNMƏ** "Hərlənmək"dən *f.is.*

**HƏRLƏNMƏK** *f.* 1. Bir şeyin ətrafında dolanmaq, fırlanmaq, aylanmaq, dövrə vurmaq. *Bağın ətrafına hərlənmək.* – *Keçəl Həmzə Çənlibeldə Dürata baxdığı zaman Qıratın da yan-yörəsinə hərlənib, özünə mehriban eləmişdi.* "Koroğlu". *Qoçaq ağacın dövrəsinə hərlənib gövdəsinə yanaşdı..* M.Rzaquluzadə. // *xüs.* Öz oxu ətrafında fırlanmaq, dolanmaq. *Çarx hərləndi və getdikcə kəndir açıldı.* C.Cabbarlı. *Val sürətlə hərlənir. Gənc bir Azərbaycan bəstəkarı tərəfindən yazılmış xəfif, rayihədar bir melodiya sərin yay küləyinə qarışaraq, talvardan uzaqlara qanad çalır.* İ.Əfəndiyev. // Havada dövrə vurmaq. *Sərçələr bağın üstündə hərlənir.* –*Çox yeriməyib uşaq durdu, başının üstə bir gecəquşu hərlənib fırlanırdı.* Çəmənzəminli.

2. Gəzmək, dolaşmaq, dolanmaq, gəzişmək. *Bir az bulvarda hərlənmək.* – *O tərəfdən padşah qızı dağda nə qədər hərləndisə, Güloğlanı tapa bilmədi.* (Nağıl). *Sübhanverdizadə hərlənib əlini zəngin düyməsinə dayadı, katib içəriyə girdi.* S.Rəhimov.

3. *məc.* Gəlib keçmək, ötüb keçmək, dolanıb keçmək. *Əsrlər hərləndi.* – *İllər, aylar gəldi, hərləndi, Şəms axırda bir şəhərə çatdı.* (Nağıl).

4. *məc.* Qurdalanmaq, vurnuxmaq. *Orada nə hərlənirdin?* – [Eyvaz:] *Bu gecə vaxtı burada nə hərlənirsən?* "Koroğlu".

**HƏRLƏTMƏK** b a x **hərləmək** 1-ci mənada.

**HƏRRAC** *is.* [*ər.*] Bir mülkün, şeyin ən çox pul verənə verilmək üzrə açıq satışa qoyulması; auksion, müzaidə. *Bir yerdə ki, millətin haqqı hərrac malıdır; O ölkədə Vətən də, el də satılmalıdır.* B.Vahabzadə. ☐ **Hərrac bazarı** – qədimdə qul satılan bazar. *Yerli Azərbaycan feodalının hərrac bazarından satın alınmış qulu olan Elxan Azərbaycan xalqının bütün düşmənlərini öz şəxsi düşməni adlandırır və onlara qarşı çıxır.* M.Arif. **Hərraca qoymaq** – hərrac qaydası ilə satışa qoymaq. *Mülkü hərraca qoymaq.* – [Koroğlu Bolu bəyə dedi:] *Balam, bu Həsən paşa mənim yolumda qızlarını nə yaman hərraca qoyub satır?* "Koroğlu". [Hacı Əhməd:] *Bəs mən ölmüşəm ki, diri-diri mənim bağımı hərraca qoyasan?* C.Cabbarlı.

**HƏRTƏRƏFLİ** *sif.* Bir şeyin bütün cəhətlərini qavrayan, onun hər tərəfini nəzərdə tutan; ətraflı, hərcəhətli. *Məsələnin hərtərəfli müzakirəsi. Hərtərəfli inkişaf. Hərtərəfli bilik.* – "*Molla Nəsrəddin" çürümüş, köhnə, yaramaz, üfunət saçan həyat və ictimai əlaqələrin hərtərəfli və öldürücü tənqidçisidir.* M.İbrahimov. // Zərf mənasında. *Hərtərəfli kömək göstərmək.* – [Murad] *görəcəyi işi hərtərəfli mühakimə edərdi.* S.Hüseyn.

**HƏRZƏ** [*ər.*] 1. *is.* Mənasız söz, boş söz, hədyan, söyüş. *Bu hərzəvü hədyanlara kimlər qulaq asdı; Kim verdi bu axmaq sözə qiymət, uçitellər?* M.Ə.Sabir.

2. *sif.* Mənasız, boş, cəfəng, nalayiq. *Hərzə sözün mərəzi gələr.* (Ata. sözü). *Zeynal özünün və evinə gələn qonaqlarının hər bir nalayiq və hərzə hərəkətlərini "yeni həyatın icabatı" deyə göstərmiş, .. Mehribandan üzr istəməklə könlünü ələ almışdı.* S.Hüseyn. // Zərf mənasında. *Adam var ki, dediyindən utanmaz; Hey hərzə danışır üzə dünyada.* Aşıq Ələsgər. *Hərzə danışma, kişi, gözlə ədəb, zinhar!* M.Ə.Sabir.

3. *sif.* Boşboğaz, çərənçi, lağlağı, ağzıgöyçək, ağzıyava, hərzəgu. *Yoxsa, ay hərzə kişi, bir quru sözdən ötəri; Darıxırsan, deməyirsən ki, uşaqdır uşağım.* M.Ə.Sabir. *Kapitan hərzə adamlara məxsus bir əda ilə gülümsədi.* P.Makulu.

◊ **Hərzə yerə** – boş yerə, əbəs yerə, mənasız. *Hərzə yerə laflar vurarsan; Torpaq ilə gülü sovurarsan.* Xətayi.

**HƏRZƏ-HƏRZƏ** *zərf* Mənasız, boş-boş. *Hərzə-hərzə danışıb gülməz idim; Ər nə şey olduğunu bilməz idim.* M.Ə.Sabir. // *sif.* Nalayiq, ədəbsiz, həyasız. *Səlim ağa hiss etdi ki, bircə an ayaq saxlasa, söyüş qarışıq hərzə-hərzə sözlər eşidəcək.* M.İbrahimov.

**HƏRZƏKAR, HƏRZƏGU** *sif.* və *is.* [*ər.* hərzə və *fars.* ...kar, ...gu] Hərzə danışan, boşboğazlıq edən; boşboğaz. *Hərzəkar adam. Hərzəkarın biridir. – Baxma firibinə hərzəguların; Aralıq vurmaqdı işi buların.* Q.Zakir.

**HƏRZƏLİK** *is.* Boşboğazlıq, naqqallıq, zəvzəklik; həyasızlıq, sırtıqlıq, ədəbsizlik, utanmazlıq, ağzıyavalıq, ağzıpərtövlük. ☐ **Hərzəlik etmək** – hərzə-hərzə danışmaq, ədəbsiz danışmaq, yava-yava sözlər danışmaq, heyvərə sözlər demək, ağzına gələni danışmaq.

**HƏS** *təql.* Minik və ya qoşqu heyvanını dala vermək üçün çıxarılan səs. *"Həs" deyib atın yüyənini dartdı.*

**HƏSB-HAL** *is.* [*ər.*] Baş-başa söhbət, hallaşma, dərdləşmə, bir-birinə öz halından danışma. *Qocaların həsb-halı. – Arabir səssiz də danışır insan; Arabir sözsüz də keçir həsb-hal.* S.Vurğun. *Bu nömrədə jurnal axundun öz dili ilə həsb-halını yazırdı.* Mir Cəlal. ☐ **Həsb-hal etmək** – baş-başa verib söhbət etmək; bir-birinə öz halından danışmaq, dərdləşmək, hallaşmaq. *Sübhə qədər eləyir öz-özüylə həsb-hal; Araq qədəhlərini boşaltdıqca dalbadal.* S.Rüstəm.

**HƏSƏD** *is.* [*ər.*] 1. Paxıllıq. *Onun saf qəlbində nə qəzəb, nə kin; Nə həsəd, nə də ki, bir xəyanət var.* S.Vurğun. *Bu kəndin yeri, torpağının yetirdiyi məhsul qonum-qonşu kəndlərin həsədinə səbəb olardı.* S.Rəhimov. ☐ **Həsəd aparmaq (etmək, çəkmək)** – paxıllıq etmək, paxıllığını çəkmək. *Hər kəs eşqimizə həsəd aparsın; Hər kəs hüsnümüzün olsun heyranı!* M.Müşfiq. *Hamının gözü Nəcəfdə idi. Ona həsəd edənlər də vardı.* Q.İlkin. *Dostum, doğrudan da, qəribədir, sən; Mənim taleyimə həsəd çəkirsən.* Ə.Kürçaylı.

2. **Həsədlə** şəklində zərf mənasında. *Elə ki, köksünə sıxır qarmonu; Oğlanlar ona bir həsədlə baxır.* N.Xəzri. [Qəndab:] *Qız həsədlə köksünü ötürür, öz bəxtindən şikayət edirdi.* B.Bayramov.

**HƏSİR** *is.* [*ər.*] Bəzi ağacların liflərindən, küləşdən, qamışdan və s.-dən toxunan məmulat (yerə sərmək və s. məqsədlər üçün işlədilir). *Ustalar əllərini yuyub, gavalı ağacının altına salınmış həsirin üstə əyləşdilər.* Çəmənzəminli. [Sarıköynək] *çox vaxt həyətdə oturub həsir toxuyardı.* S.Hüseyn. // Həmin məmulatdan toxunmuş və ya düzəldilmiş. *Həsir şlyapa. – Ranqunun kənarları yüngül qamış və ya həsir evlərdən ibarətdir.* M.İbrahimov.

◊ **Bir həsir, bir Məmmədnəsir** – çox kasıb, yoxsul, heç bir şeyi olmayan adam haqqında. [Bəbir bəy:] *Sənin kimi oğlanı belə bir həsir, bir Məmmədnəsir görəndə vicdanım ağrıyır.* Mir Cəlal.

**HƏSİRÇİ** *is.* Həsir toxuyan adam, usta.

**HƏSLƏMƏ** "Həsləmək"dən *f.is.*

**HƏSLƏMƏK** *f.* Geri çəkilmək (bəzən qorxudan, ehtiyat edərək). *Qorxudan həsləmək. Hərif həslədi. –* [Kazım:] *Xan .. mənim zarafatımdan həslədi.* Çəmənzəminli. [Pənah:] *Haqqın qabağında həslədi xaqan.* M.Rahim. // Atı-arabanı geri sürmək, geri çəkmək.

**HƏSR** *is.* [*ər.*]: **həsr etmək** – yalnız bir işə, bir şəxsə və s.-yə vermək, onun üçün ayırmaq, ona sərf etmək. *Bütün həyatını incəsənətə həsr etmək. Vaxtının çoxunu mütaliəyə həsr etmişdir. Bütün qüvvəsini sülh uğrunda mübarizəyə həsr etmək. – Jurnalın rəhbəri Cəlil Məmmədquluzadə bütün qüvvə və enerjisini, bütün fikir və vaxtını jurnala həsr etmişdi.* M.İbrahimov.

**HƏSRƏT** *is.* [*ər.*] 1. Bir şeyi və ya birini bir daha görmək, qovuşmaq arzusu. *Vətən həsrəti. Övlad həsrəti. –* [Fitnə:] *El qızıyam mən, Bəxtiyar; Ürəyimdə həsrətim var.* A.Şaiq. *Bir anda Sonanın halı dəyişdi, həsrət və məhəbbət*

*qəribə bir marağa və şübhəyə çevrildi.* M.İbrahimov. // Ələ keçməyən və ya əldən çıxmış bir şeyə təəssüflənərək çox acıma, mənəvi iztirab keçirmə. *Mayanın kədəri və göz yaşlarında sanki Zeynəbin öz gəncliyinin həsrətləri dilə gəlib danışırdı.* M.İbrahimov. ☐ **Həsrət qalmaq** – istədiyinə çatmamaq, arzu etdiyi bir şeyi ələ keçirə bilməmək, arzusu ürəyində qalmaq. *Ömrüm ah-vayınan keçdi dünyada; Həsrət qaldım, əlim yara yetmədi.* Aşıq Ələsgər. [Padşah oğluna:] *Məgər Allaha rəvadırmı, mən özüm padşah ola-ola bağımdakı almaya həsrət qalım?* Çəmənzəminli. [Qönçə] *Ataşın üzünə həsrət qalmaq qorxusu ilə titrədi.* Ə.Vəliyev. **Həsrət qoymaq** – arzusuna, istəyinə çatmağa, arzusu həyata keçməyə qoymamaq. *Xan Əsliyə həsrət qoydun Kərəmi.* "Əsli və Kərəm". **Həsrət(ini) çəkmək** – çox arzusunda olduğu, lakin əldə edə bilmədiyi bir şeyin üzüntüsünü çəkmək; son dərəcə arzulamaq. *Doğma yerlərin həsrətini çəkmək. – Aylar, illər həsrətini çəkərdim; Şükür, yetdim vüsalına, sevdiyim!* M.V.Vidadi. [C.Cabbarlı] *üçün, onu bir dəfə görmək üçün hamı həsrət çəkirdi.* S.Rəhman. **Həsrətində olmaq** – b a x **həsrətini çəkmək**. [Əsəd] *sanki ömrü boyu həsrətində olduğu böyük bir arzusuna çatmışdı.* B.Bayramov.

2. Yaxın adamından, sevgilisindən ayrılma; ayrılıq, fəraq, hicran. *Vaxt yetişdi, anası .. rəhmətə getdi; Bu həsrətin ağrısını duydu Əmirxan.* S.Vurğun. *Hicran çəkən bilir həsrət yamandır.* R.Rza.

3. **Həsrətlə** şəklində *zərf* – şiddətli arzu ilə, həsrət ifadə edən nəzərlərlə. *Həsrətlə oğluna baxmaq. –* [İncə səs:] *Vəhşi bir gül olsam, ətrafım tikan; Həsrətlə süzərdi hər görən məni.* H.Cavid. *Meydanın başında bir ağ bina var; Qız hərdən çevrilib həsrətlə baxır; Kitablı-dəftərli gedən uşaqlar; Ordan gülər çıxır, ordan şən çıxır.* N.Xəzri.

**HƏSRƏTKEŞ** *sif.* və *is.* [*ər.* həsrət və *fars.* ...keş] Həsrət çəkən, bir şeyin həsrətində olan. *Həsrətkeş ana. – İki həsrətkeş bir-birinə sarmaşdı.* "Əsli və Kərəm". *Qanadlan, qanadlan, ötüb dağ, meşə; De ürək sözümü o həsrətkeşə.* M.Rahim.

**HƏSRƏTLİ** *sif.* 1. Ürəyində həsrəti, arzusu, istəyi olan; diləkli, arzulu; həsrətkeş. *Həsrətli valideyn. Həsrətli sevgililər. – Beyrək və yoldaşları cəfakeş kürəkçilərlə həsrətli doğma qardaşlar kimi bir-birlərinə sarmaşdılar.* M.Rzaquluzadə. *Ümid .. uzaq səfərdən gəlmiş həsrətli adam kimi anası ilə qucaqlaşdı.* B.Bayramov.

2. Həsrət ifadə edən. *Həsrətli baxış. –* [Sarıköynək] *məndən ayrılarkən həsrətli bir ah çəkdi.* S.Hüseyn. *Həsrətli gözlərlə boylanır qarı; Külləri soyumuş ocağa sarı.* S.Vurğun.

**HƏSSAS** *sif.* [*ər.*] 1. Çox tez hiss edən, duyan, başa düşən, dərk edən, qavrayan. *Həssas adam. –* [Zakir:] *Axı Mehriban həssas qızdır.* H.Seyidbəyli. *Leyla təəccübləndi: – Son dərəcə həssas oğlandır, – deyə ürəyindən keçirdi.* B.Bayramov. // Çox tez təsirlənən, mütəəssir olan; riqqətli. [Halay Şiraslanın könlünü almaq üçün dedi:] *Həssas qəlbinə toxunduğumuz üçün üzr istəyirik.* S.Rəhimov. [Salman Mayaya:] *Musiqi həssas ürəkləri titrədir.* M.İbrahimov. // *məc.* Qəlbinazik, ürəyiyumşaq, şəfqətli, riqqətli, canıyanan. *Möhsünzadə bir qədər həssas adam idi. Onu hər şeydən artıq aralıqda qalacaq uşaqların faciələri mütəəssir edirdi.* S.Hüseyn.

2. Qıcıqlanmağı hiss edən, duyan. *Həssas hüceyrələr. Həssas əsəb toxumaları. Həssas dəri.*

3. *xüs.* Ən cüzi xarici təsiri əks etdirə bilən. *Həssas cihaz. Həssas tərəzi.*

**HƏSSASLIQ** *is.* 1. Həssas adamın xüsusiyyəti, keyfiyyəti. [Dilbər Əbdüləli bəyə:] *Sizdə cəsarət və həssaslıq yoxsa, öz bəxtinizdən küsün.* C.Cabbarlı. *Gülər* [Elmarın] *bu həssaslığına heyrətdən çox, tavanasız bir dərd ilə baxırdı.* İ.Əfəndiyev.

2. Həssas şeyin keyfiyyəti. *Cihazın həssaslığı. Dərinin həssaslığı.*

3. **Həssaslıqla** şəklində *zərf* – diqqətlə, qayğı ilə, qayğıkeşliklə, ürək yanğısı ilə, xeyirxahlıqla. *Şikayətçini həssaslıqla dinləmək.*

**HƏŞƏM** *is.* 1. Döyülmək üçün dərzdən açılıb xırmana tökülən taxıl. *..Vələ qoşulmuş öküzlər, atlar həşəmin üstündə günortaya qədər hərlənir, birtəhər dəni küləşdən ayıra bilirdilər.* B.Bayramov. ☐ **Həşəm etmək** – taxılı dərzlərdən açıb döyülmək üçün xırmana tökmək. [Uşaqlar:] *Eybi yoxdur, biz həşəm eləyənədək gün qızar.* Q.İlkin.

2. Quru ot, ələf. *Qızıl gülü dərərlər; Həşəm üstə sərərlər; Rəngimi yar saraldıb; Qızdırmadan görərlər.* (Bayatı). *Bezdən bir adam fiquru tikib içinə həşəm doldurardılar.* H.Sarabski.

**HƏŞƏMƏT** *is.* [*ər.*] Əzəmət, böyüklük, ululuq, şan və calal. *Tarxan Nüşabənin həşəmət və əzəmətinə heyran qalmışdır.* A.Şaiq.

**HƏŞƏMƏTLİ** *sif.* Əzəmətli, ulu, böyük, calallı. [Qətibə:] *Bəli, həşəmətli mələkə! Hüsaməddin həzrətlərinin özü şəxsən məktubu mənə tapşırdı.* M.S.Ordubadi.

**HƏŞƏRAT** *is.* [*ər.* "həşərə" söz. cəmi] 1. Cücülər. *Həşəratın əkinlərə zərəri. Kimyəvi və bioloji üsulla həşəratı məhv etmək.* – [Ahuramazda:] *Ən savab işlər – susuz yerə su çıxarmaq, ağac əkmək, körpü salmaq, zərərli həşəratı öldürməkdir.* Çəmənzəminli. [Tağı əmi:] *Kərtənkələlərin zəhəri yoxdur. Özləri də zəhərli həşəratı yeyib tələf etməklə bizə böyük mənfəət yetirirlər.* S.S.Axundov.

2. *məc.* Dəyərsiz və zərərli adamlar haqqında. *Bunlar adam deyil, həşəratdırlar.* – [Mahmud bəy:] *Biçarə nə eyləsin, həşəratlardan hər nə pis iş desən gözləmək olar.* N.Vəzirov. [Polkovnik:] *Həşəratlar* [kəndə] *gedən dəmir yolunu dağıdıblar...* S.Vəliyev.

**HƏŞƏRATYEYƏN** *sif.* Həşəratla, cücülərlə qidalanan. *Həşəratyeyən quşlar.*

**HƏŞİR** *is.* [*ər.*] 1. B a x **qiyamət** 1-ci mənada.

2. B a x **qiyamət** 3-cü mənada. [Kəndlilər:] *Bu həşir kimin evindədir? – deyə soruşurdular.* T.Ş.Simurq.

3. **Həşrədək** şəklində *zərf* – qiyamətəcən, heç vaxt. [Əmiraslan ağa:] [Onlara] *elə toy tutmuşlar ki, ta həşrədək yadlarından çıxarmazlar.* S.S.Axundov. *Məsəldir bu, gedər qılınc yarası; Sağalmaz həşrədək dərin söz dağı.* M.Rahim.

4. **Həşrində** şəklində – hayında, qayğısında, fikrində, qeydində. *Keçi san həşrindədir, qəssab piy hayında.* (Məsəl). *Şamo hərlənirdi, hər kəs öz başının həşrində idi.* S.Rəhimov.

◊ **Həşir qoparmaq (qatmaq, salmaq)** – b a x **qiyamət qoparmaq** 1-ci mənada. (**"qiyamət"**də). *..Ata və ana qarğa Nurəddinin başı üstünü alıb, elə həşir saldılar ki, deyəsən, bu saat onu dimdikləyib yerə salacaqdılar.* S.S.Axundov. [Gülçöhrə:] *İndi Asyaya desən ki, gəl səni* [arşınmalçıya] *ərə verək, bir həşir qatar, deyər ki, mən arşınmalçının tayıyam?* Ü.Hacıbəyov. [Muxtar:] *Mən bu işə iqdam eləyəndə bilirdim ki, bir gün açılacaq, arvadım biləcək, həşir qoparacaqdır.* B.Bayramov. **Həşir qopmaq** – b a x **qiyamət qopmaq** ("**qiyamət**"də). *Evdə bir həşir qopdu ki, gəl görəsən.* "Kirpi". **Həşirə qalmaq** – b a x **qiyamətə qalmaq** ("**qiyamət**"də). **Həşirə qədər** – b a x **qiyamətə qədər (qiyamətəcən)** ("**qiyamət**"də).

**HƏŞTAD** [*fars.*] b a x **səksən**. [Qoşatxan:] *Həsənbəy hələ həştad il əvvəl demişdi ki, müəllim gərək çıraq kimi yanıb kəndçinin yolunu işıqlandırsın.* M.İbrahimov.

**HƏŞTADINCI** b a x **səksəninci**. *Keçən əsrin həştadıncı illərində. Həştadıncı otaq.*

**HƏŞTADİLLİK** b a x **səksənillik**.

**HƏŞTADYAŞLI** b a x **səksənyaşlı**. *Həştadyaşlı qoca.*

**HƏTTA** *bağl.* [*ər.*] Cümlədə aid olduğu sözü və ya söz birləşməsini ayırmaq və gücləndirmək üçün işlədilir – üstəlik, həm də, belə. *Onu gördüm, hətta söhbət də etdim. Hamı, hətta uşaqlar da diqqətlə qulaq asırdılar.* – *Otların hamısı, hətta tikanlı boz qanqallar da çiçək açmışdı.* İ.Əfəndiyev. [Əntərzadə] *nəinki səliqə və məharətini, hətta başını da itirdi.* Mir Cəlal. // Bəzən təkid üçün "belə" ədatı da əlavə olunmaqla işlədilir. *Hətta gözümlə görsəm belə inanmaram.* – *Səba xanımın özü də Atabəylə tez-tez görüşməyi, hətta lazım olmadığı zaman belə adi bir işi bəhanə edərək, Atabəyin otağına soxulmağı sevirdi.* M.S.Ordubadi.

**HƏVALƏ** *is.* [*ər.*] 1. Birinin üzərinə, öhdəsinə buraxma, qoyma, tərk etmə; birinə tapşırma. ☐ **Həvalə edilmək (olunmaq)** – üzərinə, öhdəsinə buraxılmaq, qoyulmaq, tapşırılmaq. [Xəlil:] *Bax, çay hazır, tökülməsi də gənc xanıma həvalə olunur.* Çəmənzəminli. *Qız zərif əlləri ilə paltar yudu, xəmir yoğurdu, hətta axır zamanlar çörək yapmaq da ona həvalə olundu.* T.Ş.Simurq. **Həvalə etmək** – üzərinə, öhdəsinə buraxmaq,

qoymaq, tapşırmaq. [Qüdrət:] *Sərdar bu vəzifəni* [Cavad ağaya] *həvalə edib.* M.S.Ordubadi. *Böyük qardaşının* [Nəsirə] *həvalə etməkdə olduğu xüsusi işləri o qədər çox olardı ki, axşamadək ancaq onların öhdəsindən gələ bilərdi.* S.Hüseyn.

2. *mal.* Bir ödənişin başqa şəxsin adına keçirilməsi.

**HƏVALİ** *is.* [*ər.*] Ətraf, ətraf yerlər, civar. *Şəhər həvalisi. Bu həvalidə heç kəs yaşamır.* – [Seyid Səməd:] *Yaxşı olar ki, həvalidəki dövlətli kəndlərin birində bir ocaq binası qoyaq.* Ə.Haqverdiyev.

**HƏVARİ** *is.* [*ər.*] Xristian dini rəvayətinə görə, İsa peyğəmbərin, İncilin ehkamlarını yaymaqla vəzifələnmiş 12 əshabəsinə – şagirdinə verilən ad (adətən cəm şəklində – **həvariyyun**, **həvarilər** şəklində işlənir); apostol.

**HƏVƏ** *is.* Xalça, palaz və s. toxuyarkən ilməkləri döyüb yerində bərkitmək üçün (bəzi heyvanların buynuzundan, yaxud da metaldan və s.-dən qayrılan) ucu kəsik, dişli alət. [Ləbbeyk] *..boyaqdan yenicə çıxmış əlvan ipləri yan-yörəsinə tökür, .. həvəni qayışına taxır, yumaqları top kimi oynada-oynada həvəslə işləyirdi.* Mir Cəlal.

**HƏVƏDİŞ(Lİ)** *sif.* Dişləri həvə dişi kimi iri olan. *Həvədiş*(*li*) *kişi.*

**HƏVƏLƏMƏ** "Həvələmək"dən *f.is.*

**HƏVƏLƏMƏK** *f.* Xalça, palaz və s. ilməklərini həvə ilə döyüb yerində bərkitmək (b a x **həvə**).

**HƏVƏLƏNMƏ** "Həvələnmək"dən *f.is.*

**HƏVƏLƏNMƏK** *məch.* Həvə ilə döyülüb bərkidilmək (b a x **həvə**). *Mürsəl bilirdi ki, xalça nə qədər çox həvələnsə bir o qədər qumaş çıxar.* H.Şərifov.

**HƏVƏNG, HƏVƏNGDƏSTƏ** *is.* Müxtəlif bərk maddələri döyüb toz halına gətirmək üçün bürünc, saxsı, dəmir və s.-dən düzəldilmiş qab və dəstəkdən ibarət alət. *Saxsı həvəng. Süxurları həvəngdəstədə döymək.* – [Mirzə Qoşunəli:] *..Xoruz birinci dəfə banladıqda dərmanları həvəngə töküb döyməyə başlayacağam.* Ə.Haqverdiyev. *Nisəbəyim .. həvəngdəstədə döyülmüş otların-çiçəklərin suyundan .. məlhəm hazırladı.* B.Bayramov.

**HƏVƏS** *is.* [*ər.*] 1. Bir şeylə məşğul olma, bir iş görmə arzusu: meyil, istək. *Oxumaq həvəsi. Uşağın mütaliəyə böyük həvəsi var. Getməyə heç həvəsim yoxdur.* – *Bir qədər keçəndən sonra musiqiyə olan həvəsim o qədər azaldı ki, başıbəlalı düdüyü bilmərrə gözdən saldı.* C.Məmmədquluzadə. *Evi, otağı səliqəyə salmaq, yeni ili bir təmizlik içərisində qarşılamaq ümumi bir həvəs idi.* H.Sarabski. ◻ **Həvəs etmək (göstərmək)** – b a x **həvəslənmək**. *Lakin həvəs eyləməzdi Leyli; Olmazdı bu ləhvü ləəbə meyli.* Füzuli. *Teymur nədənsə bu evə gəlməyə daha çox həvəs göstərirdi.* H.Seyidbəyli. **Həvəs oyanmaq** – maraq oyanmaq, arzu oyanmaq. [Oğlanın] *zehnində bu adamı öyrənmək, onun sirlərini bilmək üçün böyük bir həvəs oyandı* H.Nəzərli. **Həvəsdən düşmək** – bir işi görməyi daha istəməmək, həvəsi, marağı soyumaq, daha həvəsi olmamaq. [Mahmud Sevincə:] *..Mən gündəngünə həvəsdən düşdüm.* Z.Xəlil. **Həvəsə düşmək (gəlmək)** – b a x **həvəslənmək**. ..[Qoşqar] *kranın altında göllündikcə ortasından xırdaca deşik açılıb burulğan kimi burulan suya baxdı və təzədən həvəsə düşüb qurşaqdan yuxarı soyundu.* İ.Hüseynov. **Həvəsə gətirmək (salmaq)** – b a x **həvəsləndirmək**. *Çaqqallar pusquda durdu*; *Həvəsə saldılar qurdu.* M.Dilbazi. **Həvəsi gəlmək (doğmaq)** – b a x **həvəslənmək**. *Leylək Ələmdar çovğunun, azanın və zənglərin qat-qarış səslərinə qulaq verir, onda bir qarət həvəsi doğurdu.* S.Rəhimov. [Pərşan:] *Bağçamız nəyə desən dəyər, adamın həvəsi gəlir baxsın.* M.İbrahimov. **Həvəsi soyumaq** – b a x **həvəsdən düşmək**. // Keçici, müvəqqəti, keçib-gedən arzu, meyil. *O da bir həvəs idi, gəldi, keçdi.*

2. Nəşə, zövq. *Tərlan xanım böyük yaradıcılıq həvəsi içərisində idi.* S.Rəhimov. *Şeyda bülbül bir həvəsdə; Gözü yolda, könlü səsdə.* Aşıq Hüseyn.

3. **Həvəslə** şəklində *zərf* – ürəkdən, qəlbdən, can-dildən, məmnuniyyətlə. *Bir əməllə, bir arzuyla alışıb onlar; Bir məqsədin yollarına düşdü həvəslə.* S.Vurğun. *Fərman nəşə və həvəslə öz ekskavatorunda işləyirdi.* Ə.Sadıq.

**HƏVƏSİMƏ** "Həvəsimək"dən *f.is.*

**HƏVƏSİMƏK** *f.* Həvəslənmək, həvəsə gəlmək, həvəs göstərmək. *Aynalını təmiz-*

*ləyib qurtaran Həcər həvəsiyir, sanki aynalı ilə oynamağa başlayırdı.* S.Rəhimov. *Eşidənlər belə bir şöhrətli adam ilə tanış olmağa həvəsiyirdilər.* Mir Cəlal.

**HƏVƏSKAR** *is.* və *sif.* [*ər.* həvəs və *fars.* ...kar] 1. Bir şeyə, bir işə həvəsi, meyli olan, bir şeyi sevən, ona çox maraq və meyil göstərən (adam). *Teatr həvəskarı. Futbol həvəskarları. Klassik musiqi həvəskarı. – Qız tayfası toylara getməyə çox həvəskar idilər.* R.Əfəndiyev. *Cəmi yeddiillik təhsili olan Gülaçar qızğın mütaliə həvəskarı idi.* İ.Əfəndiyev.

2. Xoşuna gəldiyi bir işlə peşəkar kimi deyil, bir maraqlı kimi məşğul olan (adam). *Həvəskar bəstəkar. – Bu zaman həvəskar bir rəssam da molbertdə yerləşdirmiş olduğu bir kətan üzərinə bu iki çinar ağacının şəfəq sökərkən almış olduğu rəngi şəkil çəkməyə hazırlaşırdı.* A.Şaiq. *Bu adamların sevgisi o qədər böyük və o qədər inamlı idi ki, həvəskar artistlər bu sevgi uğrunda öz canlarından belə keçməyə hazır idilər.* S.Rəhman. // Kifayət qədər hazırlığı olmadan bir işlə məşğul olan (adam).

**HƏVƏSKARLIQ** *is.* 1. Bir şeyə, bir işə həvəsi, meyli olma; həvəs, meyil, maraq göstərmə.

2. *məc.* Xüsusi hazırlığı, biliyi olmadan hər hansı bir sənətlə, elmlə məşğul olma, ona böyük maraq göstərmə. // *məc.* Bir şeyə səthi münasibət, lazımi xüsusi bilik olmaması.

**HƏVƏSLƏNDİRİCİ** *sif.* Həvəsləndirmək, həvəs oyatmaq üçün olan; şirnikdirici. *Həvəsləndirici mükafat.*

**HƏVƏSLƏNDİRMƏ** 1. "Həvəsləndirmək"dən *f.is.*

2. Həvəsləndirici, şirnikdirici, rəğbətləndirici. *Onun payını artırmağın, daha da həvəsləndirməyin vaxtı gəlib çatdığını dərk edən Hacı, son zamanlar ziyarətə gələnlərin çoxalmasında, nəzirlərin artmasında Molla Sadığın xüsusi rol oynadığını bilirdi.* İ.Şıxlı.

**HƏVƏSLƏNDİRMƏK** *f.* Hüsn-rəğbət göstərməklə, kömək etməklə, tərifləməklə, mükafatlandırmaqla birini bir şeyə şövqləndirmək, həvəsə gətirmək, həvəs oyatmaq, şirnikdirmək. *Çalışqan işçiləri həvəsləndirmək. Uşaqları dərsə həvəsləndirmək: – Ancaq birdən, nədənsə, Tahirə elə gəldi ki, Cəmil bu sözü qəsdən onu həvəsləndirmək üçün deyir..* M.Hüseyn. *..Müsəlmanları musiqi məktəbinə həvəsləndirmək üçün onlardan ötrü konservatoriya nəzdində xüsusi şöbə açmaq lazımdır.* Ü.Hacıbəyov.

**HƏVƏSLƏNMƏ** "Həvəslənmək"dən *f.is.*

**HƏVƏSLƏNMƏK** *f.* Həvəsi gəlmək, meyil etmək, həvəsi oyanmaq, maraqlanmaq. *İdmana həvəslənmək. – ..Qardaşım kimi məktəbə getməyə çoxdan həvəslənmişdim. O gecəni də qarşısında bulunduğum böyük bir hadisənin həyəcanı içində keçirdim.* T.Ş.Simurq. *Maya danışdıqca, həvəslənir, Muğanın keçmişi haqqında maraqlı şeylər nəql edirdi.* M.İbrahimov.

**HƏVƏSLİ** *sif.* Bir şeyə və ya bir işə həvəsi olan, həvəs, meyil göstərən; meyilli. *Bədii özfəaliyyətə həvəsli uşaqları aşkar etmək.*

**HƏVƏSSİZ** *sif.* və *zərf* Həvəsi olmayan, bir işi könülsüz, istəməyə-istəməyə və ya zorla görən; ürəksiz, könülsüz, meyilsiz. *Həvəssiz cavab vermək.* – [Səkinə Züleyxanın] *yenə həvəssiz olduğunu görüb susdu.* M.İbrahimov. [Nəcmi:] *Balam, Qadir kursa çox həvəssiz gəlir.* Ə.Əbülhəsən.

**HƏVƏSSİZLİK** *is.* Bir şeyə və ya işə həvəs olmaması; könülsüzlük, maraqsızlıq, meyilsizlik. [Mehribanda] *son günlərdə iş görməyə bir həvəssizlik vardı.* S.Hüseyn.

**HƏYA** *is.* [*ər.*] 1. Abır, ar, ismət, namus, utanma hissi. *..Qulluqçuya oxşayan qızın simasında isə qüssə ilə qarışmış qəribə bir ismət və həya vardı.* M.İbrahimov. *Abır, həya, hörmət bilməyən gözəl; Çəksə də üzünə pərdə, yaraşmaz.* Aşıq Şəmşir. ☐ **Həya etmək (qılmaq)** – utanmaq, abrını gözləmək, ədəb gözləmək, özünə ar bilmək, ar etmək, xəcalət çəkmək. *Bir-iki küçə dolandısa da Nurəddin həya edib heç kəsə əl uzada* (*dilənə*) *bilmədi.* S.S.Axundov. *Gəlinin utancaqlığı, hətta gəlib başının üzərində dayanan adamın üzünə baxmaqdan həya eləməsi Səmədə daha xoş gəldi.* İ.Hüseynov.

2. *məc.* Bədənin məhrəm (örtülü, ayıb) yeri. [Çopo:] [Qızların] *həya yerlərindən başqa bədənləri tamamilə açıq idi.* Çəmənzəminli.

◊ **Həyanı yeyib, abrını tullamaq** – heç bir şeydən utanmamaq, abrını atmaq, həyasızlıq etmək.

**HƏYA-ABIR** [*ər.* həya və *fars.* abru – üz suyu] b a x **həya** 1-ci mənada [Həsən:] *Mən həya-abır bilməyən arvadın ayağına getmərəm!* M.İbrahimov.

**HƏYALANMA** "Həyalanmaq"dan *f.is.*

**HƏYALANMAQ** *f.* Həya etmək, utanmaq, abrını gözləmək, həyalı olmaq. [Kiçikxanım] *..yerə oturmaqdan həyalanırdı.* M.S.Ordubadi.

**HƏYALI** *sif.* İsmətli, abırlı, namuslu, utancaq. [Bədircahan:] *Xan, özünüz bilirsiniz ki, qız uşağı hayalı olur..* N.Vəzirov. *Zəmanənin xarab bir vaxtında nəcib, gözəl, həyalı, iffətli və ismətli bir qız tapmaq çox da asan deyildi.* S.Hüseyn. // İs. mənasında. *Həyalı qızarar, həyasız ağarar.* (Ata. sözü).

**HƏYALILIQ** *is.* Həyalı, ismətli, utancaq adamın hal və keyfiyyəti. [Qızın] *ən gözəl və sevimli xüsusiyyətlərindən birisi zahiri görünüşündə olan məhcubluğu, həyalılığı və utancaqlığı idi.* M.S.Ordubadi.

**HƏYASIZ** *sif.* Üzündə abır-həya olmayan; abırsız, utanmaz, ədəbsiz, arlanmaz, arsız. [Qəhrəman:] *Mən* [xanımı] *ilk dəfə görürəm... Amma yamanca həyasız qadındır.* H.Nəzərli. // İs. mənasında. *Der*: *– Hara gəlibsən, ey həyasız; Əldən bu işi nola qoyasız!* Xətayi. [Veys:] *Yox, dövlətli həyasızlar özlərini abırlı sayıb, arvadlarını gizlətsinlər, bizimkilər abırlı ola-ola açıq gəzsinlər!* Ə.Əbülhəsən.

**HƏYASIZ(CASINA)** *zərf* Həyasızlıqla, ədəbsizcəsinə, utanmazcasına, çəkinmədən, həya etmədən, utanmadan, arsız-arsız. *Konkada oturan ağyaxalı bir rus çinovniki ara vermədən həyasızcasına mırt-mırt mırıldanırdı.* M.S.Ordubadi. *Bu lütlərin, acların işləri kimi sözləri də çox həyasızcasına aşkar, açıq deyilirdi.* Ə.Əbülhəsən.

**HƏYASIZLAŞMA** "Həyasızlaşmaq"dan *f.is.*

**HƏYASIZLAŞMAQ** *f.* Daha da həyasız olmaq, sırtıqlaşmaq, arsızlaşmaq, qudurmaq. *Cəza almadıqca həyasızlaşmaq cinayətkarın adətidir.* M.İbrahimov.

**HƏYASIZLIQ** *is.* Abırsızlıq, utanmazlıq, arsızlıq, ədəbsizlik, sırtıqlıq; həyasız, abırsız hərəkət, söz. *Kök və əndamlı xanımın baxışlarından nə isə həyasızlığa oxşar bir cəsarət tökülürdü.* M.İbrahimov. *Səməndər* [Nərgizin] *həyasızlığına görə hiddətlənmişdi.* B.Bayramov.

**HƏYAT** *is.* [*ər.*] 1. Materiyanın hərəkətinin müəyyən inkişaf mərhələsində əmələ gələn xüsusi forması; varlıq, dirilik. *Yerdə həyatın əmələ gəlməsi. – Bunları duyduqca, düşündükcə mən; Həyata, varlığa məftun oluram.* S.Vurğun.

2. Ömür. *Əşrəf həyatında hələ heç bir qəhrəmanlıq eləməmişdi.* S.Rəhman. *Bir gün həyatımda yellər qopacaq; Ömür öz tağından salacaq məni.* M.Araz.

3. Canlı vücudun törədiyi andan yox olana qədərki dövr (bütöv dövr və ya onun bir hissəsi); ömür. *Həyatında bir dəfə də olsun xəstələnməyib. Həyatının məsud çağları. – Hər kəs bilir həyatın sonu ölümdür; Ah bu qəmli dəyişmə yaman zülümdür.* M.Müşfiq. *Şam əgər yanmırsa, yaşamır demək; Onun da həyatı yanmağındadır!* B.Vahabzadə. // İnsanın keçirdiyi ömür və gördüyü işlər; tərcümeyi-hal. *Öz həyatından danışmaq. – Açıb qarşısında külliyyatını; Öyrənir şairin o, həyatını!* S.Vurğun. [Zərqələm] *həyatından və ailəsindən danışdı.* Ə.Sadıq. // Bir adamın müəyyən yerdə yaşadığı dövr. *M.F.Axundzadənin Tiflis həyatı. – Beləliklə, Qəhrəmanın texnikum həyatı davam edirdi.* S.Rəhimov. *Cəbhə həyatı günü-gündən* [Firidunun] *qanına, vərdişinə keçirdi.* Mir Cəlal. // Məişət, yaşayış qaydası. *Avropa həyat tərzi. Şəhər həyatı. Kənd həyatı.* // Dolanacaq, yaşayış tərzi. *Tüfeyli həyat. Köçəri həyat. Sərsəri həyat.* // Dirilik, canlılıq. *Həyat əsəri yoxdur.* // *məc.* Canlanma, dirçəlmə, hərəkət, qaynaşma, qızğın fəaliyyət. *Tikinti sahəsində həyat qaynayır.*

4. *məc.* İnsanda cismani və mənəvi qüvvələrin təzahürü. *Onun hərəkət və sözlərində coşqun həyat duyulur.* □ **Həyat eşqi** – yaşamaq arzusu. *İnsanların ürəyində yeni bir həyat eşqi oyandı.* Ə.Məmmədxanlı. *Çırpınsın həyat eşqi; Gözlərində, qanında; Bundan ləkə görünməz; İnan ki, vicdanında.* N.Rəfibəyli.

5. Hər hansı bir sahədə yaşayış və inkişafı səciyyələndirən hadisələrin məcmusu. *Ölkənin təsərrüfat həyatı. Beynəlxalq həyat. Mədəni həyat. Mənəvi həyat.*

6. Bizi əhatə edən real varlıq. *Elmin həyatla əlaqəsi. Elm həyatdan ayrı yaşaya bilməz.*

◊ **Həyat keçirmək (sürmək)** – yaşamaq, ömür sürmək, ömrünü bu və ya başqa tərzdə keçirmək. *İçərişəhərdə qaranlıq, dar bir dalanda kiçik bir otaq tutub anamla yoxsul həyat keçirirdik.* A.Şaiq. *Uzun illər böyük bir etibara malik olan Nemətullayev çox sakit həyat sürər və gələcək üçün ehtiyat görərdi.* S.Rəhimov. **Həyat vermək** – canlandırmaq, ruhlandırmaq. *O vicdan qızının ehtişamı çar; Qəlbə həyat verir gülümsəyərək.* S.Vurğun. **Həyat yoldaşı** – ər və ya arvad. [Məsmə:] *Kor Seyidə nişanlandığım gündən təsəvvür etdiyim gənc həyat yoldaşımdan məhrum edilmişdim.* S.Hüseyn. *Həyat yoldaşıdır Gülyaz; Dağlarda bəslənmiş bu gül.* A.Şaiq. **Həyata keçirilmək** – yerinə yetirilmək, tətbiq edilmək. [Fəxrəddin:] *Mərhum Atabəy Məhəmmədin qətlində həyata keçirilən macəranın təkrar olunmaması üçün belə də lazım idi.* M.S.Ordubadi. **Həyata keçirmək** – yerinə yetirmək, tətbiq etmək. [Həmzə] *şəhərdə şəriki ilə bu planı həyata keçirmək üçün konkret layihə də hazırlamış, elə buna görə də .. qardaşı Salamı tələsik şəhərə göndərmişdi.* Ə.Əbülhəsən. **Həyata keçmək** – tətbiq olunmaq. [Hücum haqqında] *müqavilə olduqca müvəffəqiyyətli bir surətdə həyata keçdi.* M.S.Ordubadi. **Həyata qaytarmaq** – diriltmək, ölümdən qurtarmaq, ağır, təhlükəli xəstəlikdən qurtarmaq. *Artıq heç bir dava-dərman ananı həyata qaytara bilməzdi..* Ə.Məmmədxanlı. **Həyata vida etmək** – b a x **həyatla vidalaşmaq**. **Həyatdan geri qalmaq** – həyatın tələbi ilə ayaqlaşa bilməmək. *Ey mənim gözəl qızım; Qalma həyatdan geri; Oxu mükəmməl, qızım.* M.Müşfiq. **Həyatın nəbzini tutmaq** – həyatın tələbinə görə yaşamaq, həyatdan geri qalmamaq. **Həyatını qurban vermək** – canını fəda etmək, ölmək (bir şəxs və ya bir iş yolunda). **Həyatından keçmək** – bir adam və ya bir şey yolunda canını fəda etmək. **Həyatla vidalaşmaq** *tənt.* – ölmək. *Axşam küləkləri qarşısında uçub gedən yarpaqlar həyatla vidalaşaraq yoxluğa gedən bir bəxtin vəziyyətini təsdiq edir.* M.S.Ordubadi. **Həyat-məmat məsələsi** – b a x **ölüm-dirim məsələsi** (“**ölüm-dirim**”də).

**HƏYATBƏXŞ** *sif.* [*ər.* həyat və *fars.* ...bəxş] *kit.* b a x **həyatverici**. *Həyatbəxş və həssas bir hava* [Muxtarla xanıma] *təmas edərkən qıdıqlandırdı, coşdurdu.* Çəmənzəminli.

**HƏYATİ** *sif.* [*ər.*] 1. Həyatla, diriliklə bağlı olan. *Həyati proseslərin getməsi üçün orqanizm müəyyən enerji sərf etməlidir ki, bu da tənəffüs prosesində əldə edilir.* “Bitki fiziologiyası”. // Həqiqi həyatı, gerçəkliyi əks etdirən, həqiqətə yaxın, uyğun olan, həyatdan götürülmüş; inandırıcı. *Həyati roman.* – [Elçin:] *Neftçilərin yürütdükləri mühakimələr həyati idi.* Z.Xəlil.

2. *məc.* Zəruri, vacib, çox mühüm. *Türk teatrosu .. Azərbaycan üçün həyati məsələdir və bunun barəsində* [jurnal] *ətraflıca danışmalıdır.* Ə.Haqverdiyev.

**HƏYATİLİK** *is.* 1. Həyatla bağlı olma, həyatdan götürülmə, həqiqətə uyğunluq. *Portretin həyatiliyi. Mövzunun aktuallığı və həyatiliyi.*

2. *məc.* Yaşama və inkişaf etmə qabiliyyəti. *Canlı dilin həyatiliyi.*

3. *məc.* Zərurilik, vaciblik, mühümlük. *Tələbatın həyatiliyi.*

**HƏYATPƏRƏST** [*ər.* həyat və *fars.* ...pərəst] b a x **həyatsevər**. *Kəndli həyatpərəst adamdır.* Mir Cəlal.

**HƏYATSEVƏN, HƏYATSEVƏR** *sif.* Həyatı sevən, ondan zövq alan; şən, həmişə şad; şux. *Züleyxa .. təbiətən canlı, həyatsevən bir qız idi.* M.İbrahimov.

**HƏYATSEVƏRLİK** *is.* Həyatı, şən yaşamağı sevmə, ondan zövq alma. *Doğrudur, öz ruhu etibarilə şənlik və həyatsevərlik təbliğ edən* [“Don-Juan”, “Zorən təbib”, “Bağa qınını bəyənməz”] *tamaşalarda Molyer satirası çox zəif idi.* C.Cəfərov.

**HƏYATVERİCİ** *sif.* Həyat verən, canlandıran, cana gətirən, həyatbəxş. *Həyatverici təmiz hava.* – *İlk baharın yeni həyatverici günəşi .. soyuq qış havasına qələbə çalmaqda idi.* S.Hüseyn. *Bu ətirli, həyatverici yaz küləyi hamını ayıltdı.* Mir Cəlal.

**HƏYƏCAN** *is.* [*ər.*] 1. Hər hansı bir səbəbdən doğan daxili təlaş, narahatlıq, təşviş,

iztirab. *Qətibənin iztirab və həyəcanı həddindən aşmışdı.* M.S.Ordubadi. *Ağca həyəcandan qızarmış, başını aşağı salmışdı.* Mir Cəlal. ☐ **Həyəcan keçirmək** – narahat olmaq, təlaş keçirmək, iztirab keçirmək, həyəcanlanmaq. *Çərkəz, dostunun da həyəcan keçirəcəyini, bu xəbəri eşidən kimi əl-ayağa düşəcəyini və onun dərdinə şərik olacağını gözləyirdi.* İ.Şıxlı. *Teymur qaranlıqda qızın üzünü görə bilməsə də, onun həyəcan keçirdiyini hiss etdi.* H.Seyidbəyli. ☐ **Həyəcana düşmək (gəlmək)** – təşvişə düşmək, narahat olmaq, həyəcanlanmaq, iztiraba düşmək. *Vəliəhdə gəldikdə, gözəl qızın həya tərləri içərisində üzdüyünü görüncə həyəcana düşmüşdü.* M.S.Ordubadi. [Musa kişi] *Firidunu görmədikdə həyəcana düşdü.* M.İbrahimov.

2. Vəlvələ, çaxnaşma, küy. [Tərxan:] *Bax, nədir o axın, yürüş, həyəcan?* A.Şaiq.

3. Təhlükə, təhlükəli vəziyyət, həmin vəziyyəti bildirən siqnal. *Həyəcan siqnalı döyüşçüləri ayağa qaldırdı.* Ə.Vəliyev.

4. *məc.* Dalğalanma, kükrəmə, coşma, tüğyan. *Dənizin həyəcanını sahilin sakitliyi əvəz eləmişdi.* B.Bayramov.

5. **Həyəcanla** şəklində *zərf* – həyəcan içində, həyəcanlı surətdə, coşqunluqla. *Həyəcanla danışmaq. Həyəcanla oxumaq. – Sinif qapıları açılır birdən; Çıxır həyəcanla bir-bir uşaqlar.* N.Rəfibəyli. *Günlər həyəcanla ötüşdü bir-bir; Yatmadım bəzən də səhərə qədər.* N.Xəzri.

**HƏYƏCANLANDIRICI** *sif.* Həyəcana gətirən, təlaş doğuran, təşvişə salan, həyəcanlandıran.

**HƏYƏCANLANDIRMA** "Həyəcanlandırmaq"dan *f.is.*

**HƏYƏCANLANDIRMAQ** *f.* Həyəcana salmaq, təlaşa salmaq, təşvişə salmaq. *Bu gün gördüklərimiz bizi xeyli həyəcanlandırmışdı.* R.Rza. *Cavahirin keçirdiyi vəziyyət Teymuru da get-gedə həyəcanlandırır.* H.Seyidbəyli.

**HƏYƏCANLANMA** "Həyəcanlanmaq"dan *f.is.* *Əgər Şamxalın baxışlarındakı ürkəklik olmasaydı, Çərkəz onun həyəcanlanmasına fikir verməzdi.* İ.Şıxlı.

**HƏYƏCANLANMAQ** *f.* Həyəcana gəlmək, həyəcan keçirmək, təlaş keçirmək, təşvişə düşmək. *Saatın əqrəbi biri göstərəndə Tahir həyəcanlanmağa başladı.* M.Hüseyn.

**HƏYƏCANLI** *sif.* 1. Həyəcan keçirən, həyəcan duyan, əsəbi, əsəbiyyət halında olan, coşmuş. *Məhərrəm bütün ömründə bu qədər həyəcanlı olmamışdı.* H.Nəzərli. *Sevinc İsmayılzadəyə*: *– Sizə nə olub, niyə belə həyəcanlısınız?* Z.Xəlil. // Həyəcan, təlaş, iztirab, narahatlıq ifadə edən. *Həyəcanlı nəzər. Həyəcanlı sözlər. – Biz bu həyəcanlı baxışlarda insan ürəyinin ən əziz, ən müqəddəs hisslərini oxuyuruq.* M.İbrahimov. // Həyəcan, iztirab doğuran. *Həyəcanlı xəbər. – Birdən eşitdiyim həyəcanlı bir səs məni yuxudan ayıltdı.* S.Hüseyn. [Səfər və Tanrıverdi: *həyəcanlı bir səslə*:] *– Allah özü bağışlasın. Qurban da belə getdi...* A.Şaiq. // Həyəcan və iztirabla dolu; təşvişli, iztirablı. *Həyəcanlı anlar. – Neft və milyonlar şəhəri Bakı həyəcanlı günlər keçirirdi.* M.Hüseyn. // Zərf mənasında. *Həyəcanlı danışmaq.* – [Qonaq Mollanın] *hirsli-hirsli təsbeh çevirdiyini, həm də çox həyəcanlı olduğunu sezdi.* İ.Şıxlı.

2. *məc.* Coşqun, təlatümlü, dalğalı. *Həyəcanlı dəniz.*

**HƏYƏCANSIZ** *zərf* Həyəcan keçirmədən, həyəcan duymadan; sakit. *..Həyəcansız dar gəlir; Mənə köksün qəfəsi.* B.Vahabzadə.

**HƏYƏT** *is.* [*ər.*] 1. Adətən evin qabağında ətrafı hasar və ya başqa binaların divarları ilə əhatə olunmuş sahə. [Gülsüm] *qapını ahəstə açıb çıxdı həyətə və sinəsini sərin hava ilə doldurub boşaltdı.* Ə.Haqverdiyev. *Hər evin həyətində nar və gilənar ağacları ilə dolu bağlar var.* İ.Əfəndiyev. *Xəstəxana həyətində bülbül oxuyur; Tibb bacısı dönüb baxır əlində dərman.* M.Araz. // Hər hansı tikilini dövrələyən açıq sahə. [Hacı Əhməd:] *Bardaqları uşağın əlindən alıb,* [məktəbin] *həyətində yerə elə çırpmışam ki, saxsıları .. indi də elə oradadır.* C.Cabbarlı. [Səriyyə xala:] *Gülnaz, qızım, soraqlaş, heç olmasa məscidi tapaq, bəlkə məscid həyətində daldalanmalı bir yer oldu.* M.İbrahimov.

2. Bütün təsərrüfat tikililəri ilə birlikdə kəndli evi; ayrıca kəndli təsərrüfatı. *Kənd 150 həyəti birləşdirir.*

3. Heyvan, təsərrüfat inventarı və s. üçün bina; ümumiyyətlə, tikili. *Həyətləri birləşdirib torpaq yola çıxan, sonra da sahildəki çəmənliyi çalın-çarpaz doğrayıb Kürə enən cığırları ot basmış, kəndin üst tərəfindəki təpələrin rəngi dəyişmişdi.* İ.Şıxlı.

**HƏYƏTARASI** *sif.* Bir neçə həyətin arasında olan. *Həyətarası yol.*

**HƏYƏT-BACA, HƏYƏT-BUCAQ** *top.* Həyət və onda olan tikililər. [Ağa Kərim xan:] *..Leyla, yaxın gəl, diqqət və səy ilə həyət-bacanı təmiz-təmiz süpürtdürüb, gül kimi eylətdirərsən.* N.Vəzirov. [Əsgər bəy Rza bəyə:] *Sizli-mənli axtaraq, görək bu kağız-kuğuzu ora-bura yapışdıran, həyət-bucağa tökən kimdir?* Ə.Vəliyev.

**HƏYƏTYANI** *sif.* Fərdi təsərrüfatın yanında olan. *Həyətyanı bostan. Həyətyanı bağ. Həyətyanı torpaq sahəsi.*

**HƏZARPEŞƏ** *is.* [*fars.* həzar – min və pişə – peşə] Müəyyən, konkret peşəsi, sənəti olmayıb, hər cür işə əl atan adam.

**HƏZƏR** *is.* [*ər.*] Saqınma, uzaq olma, ehtiyat etmə, qorunma, çəkinmə, özünü gözləmə. *Ondan həzər!* (ondan özünü qoru! uzaq ol!). *Əlhəzər, ondan həzər, oxutmuram, əl çəkin! Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!* M.Ə.Sabir. ☐ **Həzər etmək (qılmaq)** – saqınmaq, qorunmaq, uzaq olmaq, özünü gözləmək. [Koroğlu dedi:] *Durub mərd meydanda göstərrəm hünər; Qənimlər nərəmdən eyləyər həzər.* "Koroğlu". *Gəl ey həmdəm, həzər qıl, eşqə düşmə; Bəladır xubları sevmək, bəladır!* Xətayi.

**HƏZƏRAT** *is.* [*ər.* "həzrət" söz. cəmi] *köhn.* Həzrətlər, cənablar, ağalar. *Qurbani həzəratın sözünü sındırmadı.* "Qurbani". [Məşədi Qadir:] *Ya şeyx, buyurun, həzəratı məsələdən agah edin.* T.Ş.Simurq. // *köhn.* Bir məclisdə, toplanışda və s.-də iştirak edən, hazır olan adamlara xitab, müraciət məqamında işlədilir – cənablar. [Rüstəm bəy:] *Həzərat! Əhvalat özünüzə məlumdur.* Ü.Hacıbəyov. [Mansur:] *Həzərat, bir fikrim vardır ki, bu şəhərdən gedəm.* C.Cabbarlı.

**HƏZİN** *sif.* [*ər.*] Hüzn gətirən, hüzn doğuran, hüznlü, kədərli, yanıqlı. *Musiqinin həzin tərənələri. – Bu həzin bulaq şırıltısı Kazımın qulaqlarında .. ağır bir həyat faciəsi kimi təsirli idi.* M.İbrahimov. *Həzin nəğmə deyir indi bağça, bağ; Yadıma yaxınlar, uzaqlar düşür.* N.Xəzri. // Hüzn, kədər ifadə edən. *Həzin bir çöhrə. Həzin bir baxış.* – [Səttar] *qapını açmaq istəyirdi ki, qulağına həzin və ürəkyandırıcı bir səs gəldi.* P.Makulu.

**həzin-həzin** *zərf* Həzin, kədərli bir surətdə, qəmli-qəmli, yanıqlı-yanıqlı. *Həzin-həzin oxumaq.* – [Sayalı xala] *yuxuda gördü ki, Xasay xəstələnmişdir, həzin-həzin inildəyir.* Ə.Vəliyev. *Beləcə vidalaşır iki əziz sevgili; Həzin-həzin hardasa çalınır uzaqda ney.* Ə.Cəmil.

**HƏZM** *is.* [*ər.*] Yeyilən şeyin həzm cihazında həll olunması. *Həzm prosesi. – Qidanın çeynənməsi, müxtəlif şirələr təsiri altında onun dəyişilərək həll oluna biləcək hala düşməsi həzm adlanır.* "Zoologiya" ☐ **Həzm cihazı** – yeyilən şeyi həll edən bədən üzvləri (ağız boşluğu, qida borusu, mədə və bağırsaqlar). **Həzm etmək** – mədədə həll etmək (yemək haqqında). *Yediyini həzm edə bilmir.* **Həzm olmaq** – mədədə həll olmaq (yemək haqqında). *..Xörək həzm olmaqdan ötrü, yəni əriyib bağırsaqlardan keçib bədənə daxil olmaqdan ötrü su lazımdır.* H.Zərdabi.

◊ **Həzm etmək** – 1) dözmək, udmaq, qəbul etmək. *Adam hər sözü həzm edə bilmir. – ..Hacı Səməd xanın həzm edə bilməyəcəyi bir vəziyyət törənmişdi.* M.S.Ordubadi; 2) başa düşmək, dərk etmək, ağlına sıxışdırmaq. *Xudpəsənd xan bir zamanlar həmin bəylər, əyanlar qarşısında məğlubiyyətə düçar olduğunu hələ də həzm edə bilməmişdi.* Ə.Məmmədxanlı. **Həzmi-rabedən keçirmək** *zar.* – 1) yemək, udmaq. *Qazanla və nimçələrlə plovu, halvanı, külçələri həzmi-rabedən keçirən dövlətlilər və mollalar idi.* H.Sarabski; 2) *məc.* mənimsəmək, boğazından ötürmək, sahiblənmək, özünə mal etmək. [Musa bəy] *dörd yetimə bir-birinin dalınca qəyyum olub, hamısının da var-yoxlarını həzm-rabedən keçirmişdi.* Ə.Haqverdiyev.

**HƏZRƏT** *is.* [*ər.*] *köhn.* Müqəddəs sayılan şəxslərin adlarının əvvəlinə gətirilərək təzim və ehtiram bildirən söz – cənab. *Möcüzi-ləli-ləbin həzrəti-İsa nə bilir? Nazi-əndamını*

*Şirinü Züleyxa nə bilir?* Q.Zakir. [Yusif:] *Həzrət Abbas haqqı, ay Səməd, mən elə bilirdim, bu oxumaq zad səni dəyişdirib.* İ.Hüseynov. ☐ **Həzrətləri** şəklində – keçmişdə ehtiram və saygı əlaməti olaraq böyük və hörmətli şəxslərin adlarından sonra işlədilirdi – cənabları (indi ən çox diplomatik dildə işlənir). *Burada müsəlman camaatı bir yerə cəm olub, əl qalxızıb imperator həzrətlərinə dua edirlər.* C.Məmmədquluzadə. [Məhəmməd:] *Hərgah Atabəy həzrətləri icazə verərsə, mən iştirak edərəm...* M.S.Ordubadi.

**HƏZZ** *is.* [*ər.*] Xoş bir şeydən duyulan ləzzət, nəşə, zövq, sevinc hissi; yüksək məmnunluq hissi, xoşlanma. *Münəvvər xanım isə ağlaya-ağlaya deyirdi: – Öz həzzindən ötrü məni bir bəlaya giriftar elədin ki, axırı həlakətdir.* M.S.Ordubadi. ☐ **Həzz almaq (duymaq)** – ləzzət almaq, zövq almaq, nəşələnmək, xoşlanmaq. *Ruhnəvaz xanım Qurbanlının gəlməsindən heç bir həzz duymurdu.* Çəmənzəminli. *Rüstəm yaşamaq, qız nəvələrini böyütmək, təzə zamanədən doyunca həzz almaq istəyirdi.* S.Rəhimov. *Payız, qış və yaz ayları məktəbdə çalışan Əhməd yay məzuniyyətini ailəsi ilə birlikdə dağlarda keçirməkdən xüsusi həzz alardı.* Ə.Vəliyev.

**HIÇQIRIQ** *is.* 1. Səsini içinə alıb ağlarkən boğazdan çıxan qırıq-qırıq səslər; hıçqırtı. *Qaraş yerində donub iztirab dolu lal gözlərlə atasının dalınca baxdığı halda, bu biri otaqdan Mayanın hıçqırıqlarını eşitdi.* M.İbrahimov. *Sanki ürəklərdə qırıldı bir tel; Ağlaşma, hıçqırıq gəzdi arada.* N.Xəzri.

2. Diafraqmanın əsəbdən sıxılması nəticəsində qırtlaqdan qeyri-ixtiyari olaraq çıxan qırıq səslər; gəyirmə. [Çopo:] [Qocanın] *başı yan tərəfə əyildi və bədənini də özü ilə çəkdi, son nəfəsini bir hıçqırıqla bəyan edərək söndü.* Çəmənzəminli.

**HIÇQIRIŞMA** "Hıçqırışmaq"dan *f.is.*

**HIÇQIRIŞMAQ** *qarş.* Hıçqırıqla ağlaşmaq. *Məhbusun burnunun kəsilmiş olduğunu görən kəndlilər heyrətlə hıçqırışırdılar.* P.Makulu.

**HIÇQIRMA** "Hıçqırmaq"dan *f.is.*

**HIÇQIRMAQ** *f.* 1. Dərindən içini çəkərək ağlamaq, hıçqıra-hıçqıra ağlamaq. *Gülyaz yaylığının ucunu gözlərinə gətirdi, çiynini ata-ata hıçqırdı.* S.Rəhimov. [Bilqeyis] *hıçqırır və göz yaşları axıdırdı.* S.Vəliyev.

2. Hıçqırtı səsi çıxartmaq; gəyirmək. *Kəngərli iki-üç dəfə hıçqırdıqdan sonra xəbər aldı..* Ə.Vəliyev.

**HIÇQIRTI** b a x **hıçqırıq**. *Rəhilənin hıçqırtısını eşidən xəstə qadınların gözləri bizə zilləndi.* M.Hüseyn. *Bir himə bənd olan bir qərib kəsin; Könül hıçqırtısı, iç hönkürtüsü.* B.Vahabzadə.

**HIQQANMA** "Hıqqanmaq"dan *f.is.*

**HIQQANMAQ** *f.* Gücənmək, zora düşmək. *Kəngərli yoxuşa dirənmiş arıq yabı kimi hıqqandı.* Ə.Vəliyev. *Balaca idim, sənəyi də götürə bilməzdim, hıqqanardım..* Mir Cəlal.

**HIQQILDAMA** "Hıqqıldamaq"dan *f.is.*

**HIQQILDAMAQ** *f.* Ləhləmək (ağır fiziki iş görərkən). *Gülpəri bu dəfə səhəngini bir az belinin yuxarısına itələyib hıqqıldadı..* M.Hüseyn. [Nubar] *get-gedə yerindəcə hıqqıldayır.* S.Rəhimov.

**HIRILDAMA** "Hırıldamaq"dan *f.is.*

**HIRILDAMAQ** *f. dan.* Şit-şit, boş-boş, mənasızca gülmək. *Lovğalanıb, a görməmiş, çox da belə fırıldama! Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama!* M.Ə.Sabir. *Məhəmmədhəsən əmi qabı çəkdi qabağına və istədi çörəyini batırsın qatığa, Əhməd başladı hırıldamağa.* C.Məmmədquluzadə.

**HIRILTI** *təql.* Hırıldayan adamın çıxardığı səs. *Şahmar direktorundan ilk dəfə belə tərif eşitdiyinə görə sevinib, hırıltı ilə güldü.* M.Hüseyn. *Bir saat əvvəl eşidilən zarafatların, hırıltıların izi qalmadı.* Mir Cəlal.

**HİBRİ́D** [*lat.*] Müxtəlif cinsdən, növdən olan bitki və ya heyvanların hibridləşdirilməsi nəticəsində əmələ gələn yeni orqanizm; mələz. *Hibridləşdirmə zamanı müxtəlif növdən olan fərdlər bir-birilə cütləşdirilir və bunlardan alınan balaya hibrid deyilir.* // Sif. mənasında. *Hibrid taxıl. Hibrid qoyun. Hibrid toxum.*

**HİBRİDLƏŞDİRİLMƏ** "Hibridləşdirilmək"dən *f.is.*

**HİBRİDLƏŞDİRİLMƏK** "Hibridləşdirmək"dən *məch.*

**HİBRİDLƏŞDİRMƏ** "Hibridləşdirmək"dən *f.is.* *Öz xüsusiyyətlərinə görə az və ya çox fərqlənən müxtəlif orqanizmlərin cinsi*

*üsul və ya vegetativ orqanlarını bir-birinə calamaq yolu ilə birləşdirilməsinə hibridləşdirmə, bunun nəticəsində alınan yeni orqanizmə isə hibrid deyilir.* M.Qasımov.

**HİBRİDLƏŞDİRMƏK** *f.* Müxtəlif bitki və ya heyvan növlərini keyfiyyətcə yeni, yaxşılaşdırılmış cins, növ almaq üçün cütləşdirmək; mələzləşdirmək. *Qabaqtəpə arısı yüksəkməhsuldar arı cinsi yetişdirmək üçün xeyli əlverişlidir və istiqamətli hibridləşdirmək üçün qiymətli damazlıq materialdır.* "Gənc arıçılara məsləhətlər".

**HİCAB** *is.* [*ər.*] *klas.* 1. Pərdə, örtü. *Yaşadıqca cavanlana, enlənə; Bir hicabda, bir pərdədə əylənə.* M.P.Vaqif. // Məc. mənada. *Üzdən götürüb ədəb niqabın; Rəf eylədilər həya hicabın.* Füzuli.

2. İslam dinində: yad kişilərə görünməmək üçün qadınların üzünü örtməsi, gizlətməsi; yaşınma. [Hacı Həsən:] [İskəndərin] *hələ kefliliyi qalsın kənarda, hələ hicabı da danır. Deyir ki, gərək övrətlər üzüaçıq gəzələr.* C.Məmmədquluzadə. ☐ **Hicab etmək (eləmək)** – yaşınmaq, üzünü gizlətmək. *Könülləri çox biqərar edirsən*; *Aç bir üzün, göstər, hicab eyləmə!* A.Səhhət.

**HİCAZ** *is. mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *Hicaz üstündə oxumaq. – Bu əsas ladlardan başqa, xeyli yayılmış əlavə ladlar və lad şöbələri də vardır ki, bunlara misal olaraq aşağıdakıları göstərmək mümkündür*: *şahnaz, sarənc, bayatıkürd, hicaz, qatar və s.* Ü.Hacıbəyov.

**HİCR** [*ər.*] *klas.* b a x **hicran**. *Qəm əlindən sinə yırtdım, baş açdım*; *Hicr əlindən dadübidad eylədim.* "Qurbani". *Qədrini ayrılıq çəkənlər bilir; Hicrinlə göz yaşı tökənlər bilir.* S.Rüstəm.

**HİCRAN** *is.* [*ər.*] Ayrılıq, firqət, fəraq. *Hicran dərdi məni salıb zillətə; Səni görsəm, dərdim azalı, Güllü!* Aşıq Ələsgər. *Bu nəğmədə həm hicran dərdi, həm vüsal arzusu*, *həm yas, həm də ümid vardı.* M.Rzaquluzadə.

**HİCRƏT** *is.* [*ər.*] 1. Öz vətənini tərk edib başqa bir yerə getmə, köçmə; mühacirət. ☐ **Hicrət etmək (qılmaq)** – öz vətənini tərk edib başqa bir yerə getmək, köçmək. *Fətəli xan yanına əzm etdi, ol hicrət qılıb; Neylədi ol mərd, gör, düşmən ikən hörmət qılıb.* M.V.Vidadi.

2. Məhəmməd Peyğəmbərin 622-ci il iyulun 16-da Məkkədən Mədinəyə köçməsi (islam tarixi bu vaxtdan başlanır).

**HİCRİ** *is.* [*ər.*] Hicrətə aid, hicrətə mənsub (b a x **hicrət** 2-ci mənada). *Hicri təqvim. Hicrinin X əsrində. – Hicri tarixlə 1324-cü, miladi tarixlə 1906-cı ildə şah konstitusiyanın birinci hissəsini təsdiq etdi və bu da İranda məşrutə verilməsinin ilk böyük addımı oldu.* P.Makulu.

**HİÇ** [*fars.*] *klas.* b a x **heç**. *Ah kim, dağlarda seylab eyləyən şivən kimi*; *Hiç kim rəhm eyləməz, hərçənd fəryad eylərəm.* Qövsi. *Böylə gedərsə, Bakı əldən gedər; Qalmaz o mənada aman, hiç, hiç!* M.Ə.Sabir.

**HİDAYƏT** *is.* [*ər.*] İslam dininə görə doğru yol, düz yol, haqq yol. *Çox məclislərdə Məşədi Hüseynin şəriətdən, həqiqətdən, xilqətdən və hidayətdən bəhs etməyini Kərbəlayı Rza bir neçə dəfə eşitmişdi.* C.Məmmədquluzadə. // Doğru yol arama, doğru yolla getmə, düz yola çıxma. ☐ **Hidayət etmək** – düz yola salmaq, doğru yola dəvət etmək. [Xanım:] *İlahi, əfv diləyirəm. Günahımdan keç, məni haqq yola hidayət et.* Çəmənzəminli.

**HİDDƏT** *is.* [*ər.*] 1. Qəzəb, acıq, qeyz, hirs, sərtlik. [Gülər Gülsabaha:] *Hiddət ancaq sizin boğazınızı yırta bilər.* C.Cabbarlı. *Hiddətindən bağbanın gözləri qızardı.* S.Rəhimov. ☐ **Hiddətə salmaq** – b a x **hiddətləndirmək**. *Mirzə Cəlil öz son məqalələri ilə ruhani və qoçuları hiddətə salacağını bilirdi.* S.Vəliyev. // *məc.* Şiddət, azğınlıq, tüğyan. *Küləyin hiddəti. – Dənizin coşduqca qeyzi, hiddəti; Anam hey soruşur məndən türbəti.* M.Rahim.

2. **Hiddətlə** şəklində *zərf* – qeyzlə, sərtcəsinə. *Hiddətlə cavab vermək. – Fərhadoğlu .. cibindən ağ dəsmalını çıxarıb .. hiddətlə yaşaran gözlərini sildi.* S.Rəhimov. // Məc. mənada. *Yenə saymazyana qırmaclayaraq Abşeronu; Sovurur xəzri narın qumları hiddətlə, budur.* S.Rüstəm.

**HİDDƏTLƏNDİRİLMƏ** "Hiddətləndirilmək"dən *f.is.*

**HİDDƏTLƏNDİRİLMƏK** *məch.* Hirslənməsinə, qəzəblənməsinə, hiddətlənməsinə səbəb olmaq; qəzəbləndirilmək, qeyzləndirilmək.

**HİDDƏTLƏNDİRMƏ** "Hiddətləndirmək"dən *f.is.*

**HİDDƏTLƏNDİRMƏK** *f.* Qəzəbə, hiddətə gətirmək; qəzəbləndirmək, qeyzləndirmək. *Onun pis hərəkəti hamını hiddətləndirdi. – Bu yol ilə bütün xəbərlər yayılar, hamını hiddətləndirər*(*di*). S.Rəhimov.

**HİDDƏTLƏNMƏ** "Hiddətlənmək"dən *f.is.*

**HİDDƏTLƏNMƏK** *f.* Qəzəbə, hiddətə gəlmək; hirslənmək, qəzəblənmək, qeyzlənmək. [Gülər Gülsabaha:] *Sən çığırmasaydın, mən də hiddətlənməsəydim, danışmayacaqdım.* C.Cabbarlı. *Fatma yalvardıqca əri hiddətlənirdi, onu yenidən incitməyə başlayırdı.* Çəmənzəminli.

**HİDDƏTLİ** *sif.* və *zərf* Qəzəbli, qeyzli, hirsli, acıqlı, qəzəbnak. *Hiddətli cavab vermək. Hiddətli otaqdan çıxmaq. Hiddətli kişi. – Hiddətli dalğalar yatan çağında; Günəşin üfüqdə batan çağında; Sahillər qarşımda ümman göründü.* Ə.Vahid.

**HİDRÁT** [*yun.* hydor – su] Metal oksidlərinin su ilə kimyəvi birləşməsi.

**HİDRAVLÍK** *sif.* [*yun.*] 1. Hidravlikaya aid olan, hidravlika ilə əlaqədar olan. *Hidravlik tədqiqat.*

2. Mayelərin basqısı, təzyiqi ilə işləyən, hərəkətə gətirilən. *Hidravlik mühərrik. Hidravlik tormoz.*

**HİDRÁVLİKA** [*yun.* hydraulikos – su] Mayelərin müvazinət və hərəkət qanunları və bu qanunların praktik tətbiqi haqqında elm.

**HİDRÍD** [*yun.* hydor – su və eidos – növ] Hidrogenin başqa elementlərlə kimyəvi birləşməsi.

**hidro...** [*yun.* hydor – su] Mürəkkəb sözlərin əvvəlində, onların suya, su sahələrinə aid olduğunu bildirir; məs.: hidrobiologiya, hidroplan, hidrologiya.

**HİDROAERODRÓM** [*yun.* hydor, air və dromos – meydan, yer] Suda hidrotəyyarələr üçün aerodrom; su aerodromu.

**HİDROAKUSTÍK** *sif.* [*yun.*] Hidroakustikaya aid olan, hidroakustika ilə əlaqədar olan. *Fəal balıq ovu ilə məşğul olan gəmilərdə hidroakustik cihazlardan istifadə olunur.*

**HİDROAKÚSTİKA** [*yun.* hydor və akystikos – eşitmə] Akustikanın, səs dalğalarının suda yayılması qanunlarından bəhs edən şöbəsi.

**HİDROBİOLÓGİYA** [*yun.* hydor, bios – həyat və logos – söz] Biologiyanın, su mühitində yaşayan orqanizmlərin həyatını öyrənən bəhsi. *Dəniz heyvanlarının və bitkilərinin yayılması xüsusiyyətlərinin öyrənilməsi inkişaf edib, bioloji elminin xüsusi bölməsi – hidrobiologiya – suda həyat haqqındakı elm olmuşdur.* "Sualtı aləm".

**HİDRODİNAMÍK** *sif.* [*yun.*] Hidrodinamikaya aid. *Hidrodinamik tədqiqat. – Hidrodinamik tormozun gövdəsi orta hissədən – statordan, habelə sağ və sol qapaqlardan təşkil edilmişdir.* "Qazmada təhlükəsizlik texnikası".

**HİDRODİNÁMİKA** [*yun.* hydor və dynamikos – güc] Hidromexanikanın, mayelərin, habelə tamamilə və ya qismən mayelər içərisində olan bərk cisimlərin hərəkətini öyrənən iki hissəsindən biri (ikincisi "hidrostatika"dır). *Kompleks dəyişənli funksiyalar nəzəriyyəsi .. hidrodinamikada tətbiq edilir.* "Ali cəbr".

**HİDROENERGÉTİKA** [*yun.* hydor və energia – hərəkət] Energetikanın, su-elektrik stansiyalarında elektrik enerjisi istehsal etmək üçün su enerjisindən bəhs edən bölməsi.

**HİDROFÓN** [*yun.* hydor və phone – səs] Suda yayılan və ya əmələ gələn səs dalğalarını tutmaq üçün cihaz.

**HİDROGÉN** [*yun.* hydor və genos – doğma] Oksigenlə birləşdikdə su əmələ gətirən yüngül qaz – kimyəvi element. *Kimyəvi analiz yolu ilə müəyyən edilmişdir ki, suyu öz tərkib hissələrinə ayırdıqda, ondan iki bəsit maddə – hidrogen və oksigen alınır.* "Radioaktiv atomların tibdə və biologiyada tətbiqi". // Tərkibində hidrogen olan. *Hidrogen birləşmələri. – Kimyəvi saf su iki kimyəvi ünsür əmələ gətirir. Bunlardan biri yüngül qaz olan hidrogen qazıdır.* "Kainatın inkişafı".

◊ **Hidrogen bombası** – atom bombasının bir növü, hidrogen atomlarının nüvə ener-

jisindən istifadə olunması əsasında işləyən son dərəcə güclü partlayıcı bomba. *Hidrogen bombasının qadağan olunması uğrunda mübarizə. – ..Hidrogen bombasının mühüm tərkib hissəsini atom bombası təşkil edir.* "Kimyanı yaxşı bilirsinizmi".

**HİDROGENERÁTOR** [*yun.* hydor və generator – törədici] Su turbinindən gələn suyun hərəkət enerjisini elektrik enerjisinə çevirən elektrik generatoru.

**HİDROGEÓLOQ** [*yun.*] Hidrogeologiya mütəxəssisi. *Geoloqlar, hidrogeoloqlar, hidrotexniklər, geodezistlər, aqronomlar kanal boyunca Qaraqum səhrasını hər cəhətcə öyrənməkdədirlər.* Ə.Sadıq.

**HİDROGEOLÓGİYA** [*yun.* hydor və geologiya] Geologiyanın və hidrologiyanın, yeraltı suların mənşəyini, hərəkətini və fiziki-kimyəvi xassələrini öyrənən sahəsi.

**HİDROİNKUBÁTOR** [*yun.* hydor və incubare – yumurtlama] İsti su vasitəsilə qızdırılan inkubator.

**HİDROKÍMYA** [*yun.* hydor və *ər.* kimya] Hidrosferi əmələ gətirən suyun kimyəvi tərkibi və onun tədqiq üsulları haqqında elm.

**HİDRÓQRAF** [*yun.*] Hidroqrafiya mütəxəssisi.

**HİDROQRAFÍK** *sif.* [*yun.*] 1. Hidroqrafiyaya aid. *Hidroqrafik ekspedisiya.*

2. Su hövzələrinin (çay, göl, dəniz) təsvirinə aid olan. *Hidroqrafik xəritə.*

◊ **Hidroqrafik gəmi** – dəniz və göllərdə hidroqrafik işlər aparmaq üçün xüsusi gəmi.

**HİDROQRÁFİYA** [*yun.* hydor və grapho – yazıram] Coğrafiyanın, Yer səthi sularının tədqiqi və təsviri ilə məşğul olan şöbəsi.

**HİDRÓLİZ** [*yun.* hydor və lysis – pozulma, parçalanma] *kim.* Mürəkkəb maddənin suyun təsiri nəticəsində parçalanması. *Maqnezium-xlorid duzunun hidrolizində ayrılan sərbəst hidrogen-xlorid suda həll olaraq xlorid turşusu əmələ gətirir.* "Neftin ilk distilləsinin texnologiyası".

**HİDROLÓGİYA** [*yun.* hydor və logos – elm] Yer kürəsinin su sahələrini və təbiətdə suyun dövranını öyrənən elm.

**HİDROLOJÍ** *sif.* [*yun.*] Hidrologiyaya aid. *Hidroloji tədqiqat. – Hamı* [Quliyevin] *hidroloji kəşfiyyatı yaxşı apardığını təsdiq edə bilərdi.* Ə.Sadıq.

**HİDROLOKÁSİYA** [*yun.* hydor və *lat.* losus – yer] Suda olan cismin, onun əks etdirdiyi səs siqnalları vasitəsilə yerinin müəyyənləşdirilməsi.

**HİDROLOKÁTOR** [*yun.* hydor və *lat.* losus – yer] Suda olan cismin yerini hidrolokasiya vasitəsilə müəyyənləşdirən cihaz. *Elm və texnika insanlara hidrolokator, ya da exolot adlanan cihazı verdi.* "Eşidilməyən səslər".

**HİDRÓLOQ** [*yun.*] Hidrologiya mütəxəssisi.

**HİDROMEXÁNİKA** [*yun.* hydor və mexanika] Mexanikanın, mayelərin tarazlıq və hərəkət qanunlarını, həmçinin mayelərin yuduğu bərk maddələrlə qarşılıqlı təsirini öyrənən bəhsi.

**HİDROMETEOROLÓGİYA** [*yun.* hydor və meteorologiya] Atmosferdə suyun dövranını öyrənən elm.

**HİDROMETEOROLOJİ** *sif.* [*yun.*] Hidrometeorologiya ilə əlaqədar olan, hidrometeorologiyaya aid olan. *Hidrometeoroloji müşahidələr.*

**HİDROMONİTÓR** [*yun.* hydor və *ing.* monitor – xəbərləyici] Torpağı, dağ süxurlarını güclü su şırnağı vasitəsilə çıxarmaq üçün işlədilən qurğu, mexanizm. *Əvvəlcə çox cəsarətsiz halda tikintiyə girən və sayı çox az olan hidromonitorlar indi tikintinin əsas mexanizmindən biri olmuşdur.* Ə.Sadıq.

**HİDROPLÁN** [*yun.* hydor və *fr.* planer] b a x **hidrotəyyarə**.

**HİDROSFÉR** [*yun.* hydor və sphaira – kürə] Yer kürəsinin su örtüyü, yer üzərindəki suların məcmusu (okeanlar, dənizlər, göllər, çaylar).

**HİDROSTÁNSİYA** [*yun.* hydro və stansiya] Su-elektrik stansiyası (HES). *Mingəçevir hidrostansiyası. – Hidrostansiya ... Parlaq işıqlar; Buradan ətrafa yayılacaqdır.* M.Rahim. *Kür hidrostansiya binasının içindən keçib, turbinləri hərəkətə gətirəcək və onlar da elektrik enerjisi verəcəkdir.* Ə.Sadıq.

**HİDROSTÁTİKA** [*yun.* hydor və statos – duran] Hidromexanikanın, mayenin müvazinət

vəziyyətini, habelə maye içində olan cisimlərin müvazinətini öyrənən iki hissəsindən biri (ikincisi "hidrodinamika"dır).

**HİDROTÉXNİK** [*yun.*] Hidrotexnika mütəxəssisi. *..Geoloqlar, hidrogeoloqlar, hidrotexniklər, geodezistlər, aqronomlar kanal boyunca Qaraqum səhrasını hər cəhətcə öyrənməkdədirlər.* Ə.Sadıq.

**HİDROTÉXNİKA** *is.* [*yun.*] Su ehtiyatlarından xalq təsərrüfatının ehtiyacları üçün istifadə etmək və təbii su hadisələrinin zərərli təsiri ilə mübarizə üsulları haqqında elm; texnikanın, həmin işləri xüsusi tikinti və qurğular vasitəsilə həyata keçirən şöbəsi.

**HİDROTEXNİKÍ** *sif.* [*yun.*] Hidrotexnika ilə əlaqədar olan, hidrotexnikaya aid olan. *Hidrotexniki işlər.*

**HİDROTERAPÍYA** [*yun.* hydor və therapeia – müalicə] Müalicə məqsədilə müxtəlif vasitələrlə sudan istifadə, su müalicəsi.

**HİDROTƏYYARƏ** [*yun.* hydor və *ər.* təyyarə] Suya enmək və sudan qalxmaq üçün uyğunlaşdırılmış təyyarə; hidroplan.

**HİDROTURBÍN** [*yun.* hydor və *lat.* turbineus] Hərəkət edən su enerjisi vasitəsilə işləyən fırlanma hərəkətli turbin.

**HİFZ** *is.* [*ər.*] Qoruma, mühafizə etmə, mühafizə, qoruyub saxlama. [Seyid:] *Şəriət ehkamını hifz yolunda heç bir xidmətiniz olubmu?* Mir Cəlal. ☐ **Hifz etmək** – qorumaq, mühafizə etmək, qoruyub saxlamaq. *Ya rəbbim, adilsən, hifz elə bizi; Halal ocaqlara üzv elə bizi.* M.Araz. // Yadda saxlamaq, unutmamaq. *Deyilən sözü hifz etmək lazımdır.* – [Müsyö Jordan:] *İndi də mənim ilə durub-oturmaqdan bir para kəlimatı hifz edibdir.* M.F.Axundzadə.

**HİFZÜSSƏHHƏ** *is.* [*ər.* – səhhəti qoruma] *köhn.* b a x **gigiyena**. [Musanın nəvəsi:] *Arxadaşlar, papaqlarınızı çıxardın, bura istidir, çölə çıxanda sizə soyuq dəyər, – dediyinə görə hifzüssəhhə elminə dair yüksək məlumatı olduğunu da qeyd etmişdi*. Qantəmir. *Ehtimal həkim öz yerişində hifzüssəhhə qaydalarına riayət etmək istəyirdi.* Mir Cəlal.

**HİKKƏ** *is.* 1. Təşəxxüs, lovğalıq, iddia, mənəm-mənəmlik; tərslik. *Hikkəsindən əl çəkməmək. – Qartal qıyıltısı dumanı dəlir; İnsan hikkəsinin sahili yoxdur.* M.Araz. *Dəyişmirsən fikrini; Lap bu dünya dağıla; Öz hikkəndə qalmısan; Sən boğula-boğula.* B.Vahabzadə.

2. Acıq, hirs. *Aslan isə barıt kimi açılır, bəzən qəhərlənir və hikkəsindən ağlayırdı.* S.Rəhimov. [Zərnigar xanım] *önlüyünün ətəyi ilə gözlərini silib, hikkəsindən boğula-boğula: – Gördünmü, ay bala, – dedi, – atan mənim başıma nə oyun açdı?* İ.Şıxlı.

**HİKKƏLİ** *sif.* Hikkəsi olan, lovğa, iddialı, özündən bədgüman, təşəxxüslü, tərs. *Hikkəli qız.* – [Qasım:] *Mən fikirləşdim ki, sən çox hikkəlisən, sözündən dönən deyilsən.* S.Vəliyev. *Ağıl qızıxanda – dəvə hikkəli; Köpəndə demirəm o nəyə bənzər..* M.Araz.

**HİKMƏT** *is.* [*ər.*] 1. Müdrik söz, dərin fikir, dərin məna, müdriklik, dərinlik. *Onun sözlərində bir hikmət var. – Müdrik insanların hikmətlə dolu; Dərin söhbətinə minnətdaram mən.* M.Rahim. // İbrətamiz, nəsihətli söz, kəlam. [Fərzəli:] *Çobanın könlü olsa təkədən pendir tutar, – bu sözün hikməti böyükdür.* Ə.Sadıq.

2. *məc.* Anlaşılmaz şey, gizli səbəb, sirr, müəmma. *Bütün məclis təəccüb elədi ki, bu nə hikmətdir?* "Lətif şah". *..İtaliyada misli olmayan zəlzələ üz verib, .. alimlər oraya dolmuşlar ki, zəlzələnin hikmətlərini mümkün qədər öyrənsinlər.* C.Məmmədquluzadə.

3. Keçmişdə: fəlsəfəyə, təbiət elmlərinə, xüsusən fizikaya verilən ad. [Sabbah:] *Cəbrə, ya hikmətə vaqif bir adam; Səncə bir falçımı ya?! Anlayamam.* H.Cavid. [Məşədi İbad:] *..Mən tarixi-nadir kitabını yarısına qədər oxumuşam, ona görə hikmət elmindən yaxşı biliyim vardır.* Ü.Hacıbəyov.

**HİKMƏTAMİZ** [*ər.* hikmət və *fars.* ...amiz] Hikmətli, həkimanə, müdrikanə. *Hikmətamiz, arifanə söhbətlərin; İlhamı var o ağ tüklü sinələrdə.* S.Vurğun.

**HİKMƏTLİ** *sif.* Hikmətamiz, filosofanə, fəlsəfi fikirlərlə dolu; müdrik. *Şəkillərin arasında ibrətverici və hikmətli şeirlər yazılmışdı.* M.S.Ordubadi. *"..Vətənin yolunda ölən şəhidlər; Ölmür, qovuşurlar əbədiyyətə". Çox gözəl sözlərdir, hikmətli, kövrək..* B.Vahabzadə.

**HİL** *is. bot.* Zəncəfil ailəsindən tropik bitki və bu bitkinin ədviyyə kimi işlədilən

toxumu. *Hil tərkibində efirli yağ olan çoxillik ot bitkisidir. – Dəhlizi ətir, hil, mixək qoxusu bürümüşdü.* M.S.Ordubadi.

**HİLAL** *is.* [*ər.*] 1. Təzə çıxmış bir-iki günlük ay; aypara. *Hər gecə fəğanım yetişir göydə hilalə.* S.Ə.Şirvani. *Bir iti xəncər kimi; Göydə parlayır hilal.* M.Seyidzadə.

2. *məc.* Klassik və xalq ədəbiyyatında gözəlin qaşına işarə. *Gözüm qaldı hilal qaşın tağında; Məcnun oldum, qaldım Leyli dağında..* Aşıq Ələsgər. *Kədərim, sevincim, hicrim, vüsalım; Hilal qaşlarının arasındadır.* R.Rza.

◊ **Hilali-əhmər cəmiyyəti** – Qırmızı Aypara cəmiyyətinin köhnə adı.

**HİLALİ** *sif.* Hilal şəklində, aypara şəklində, yeni ay şəklində olan. *Hilali qaşlar.*

**HİLLİ** *sif.* Tərkibində hil olan, hil qatılmış, hil vurulmuş. *Hilli qoğal. Hilli çay.*

**HİM** *is. dan.* Birinə gözlə edilən işarə; him-cim. ☐ **Him eləmək** – birinə gözlə, qaş-gözlə işarə etmək. *Gülzar qulluqçuya him elədi ki, Züleyxanı bayıra çıxarsın.* C.Cabbarlı. *Şahsuvarov* [Sadıqovun] *çıxmasına him eləyir.* İ.Əfəndiyev.

◊ **Himə bənd** – bir işi görmək üçün işarə gözləyən, bəhanə axtaran. *Mən aşiq kimə bəndəm; Sazımda simə bəndəm; Yarla görüşmək üçün; Bir kiçik himə bəndəm.* (Bayatı). [Lətifə] *hönkürüb ağlamaq üçün ən balaca bir himə bənddi.* M.Hüseyn.

**HİMAYƏ** *is.* [*ər.*] Birini (daha zəif olanı) qoruma, ona havadarlıq və qayğı göstərmə, qanadı altına alma; himayəçilik. *Nənə himayəsində böyümək. – Telli indi bir ilə yaxındı ki, qaynının himayəsində yaşayırdı.* S.Hüseyn. *Aslan* [Mansuru] *götürüb, öz himayəsi altında saxlayaraq .. oxutdururdu.* C.Cabbarlı. ☐ **Himayə olmaq** – b a x **himayəsinə almaq (götürmək)**. [Dərviş:] *Bu fikri başından çıxart, qızım, get, atana himayə ol!* Ə.Haqverdiyev. **Himayəsinə almaq (götürmək)** – himayə etmək, havadarlıq etmək, qayğı göstərmək; sığındırmaq, qanadı altına almaq. *Yetimləri himayəsinə götürmək.* – [Səlim] *həm onu, həm oğlunu; Aldı himayəsinə.* B.Vahabzadə. // Məc. mənada. *..Qız qaratikan kolunun himayəsinə sığınmış xırdaca çiçəkli boyaqgülünün kövrək zoğlarını gördü.* Ə.Məmmədxanlı. // *məc.* Qayğı, kömək, diqqət, arxa. *Yoldaşın himayəsi.* – [Fərman Mələyə:] *Yaxşı bir dostun himayəsinə, köməyinə ehtiyacın vardır.* M.İbrahimov. ☐ **Himayə etmək** – qorumaq, qanadı altına almaq. *..İran əksinqilabını himayə edən çar hökuməti öz içərisindən çürüməkdədir.* M.S.Ordubadi.

**HİMAYƏÇİ** *sif.* Himayə edən, hamilik edən, qeydinə qalan; arxa, kömək, himayədar.

**HİMAYƏÇİLİK** *is.* Birini himayə altına alma, ona havadarlıq göstərmə; havadarlıq, himayədarlıq (bəzən mənfi mənada işlənir). [Yusif Həsrətə:] *Gözünün qabağında görmədinizmi ki, himayəçilik bizim kəndin başına nə oyun açdı?* B.Bayramov.

**HİMAYƏDAR** [*ər.* himayə və *fars.* ...dar] b a x **himayəçi**.

**HİMAYƏDARLIQ** b a x **himayəçilik**.

**HİMAYƏEDİCİ** *sif.* Himayə edən, qoruyan, qayğısına qalan; himayəkar. [Burnaşov Vaqifə:] *Mərhəmətli çariça sizə də himayəedici əlini uzatmaq istəyir. Xan yalnız bizim himayəmizlə öz taxtında baqi qala bilər..* Çəmənzəminli.

**HİMAYƏKAR** [*ər.* himayə və *fars.* ...kar] Özündən zəifi, kiçiyi, köməksizi, acizi himayə etməyi sevən, ona havadarlıq edən, qayğı göstərən. *Hər iki bacının gözləri qabağında himayəkar Qulam müəllim bütün varlığı ilə canlandı.* S.Rəhimov.

**HİMAYƏSİZ** *sif.* Himayə edəni, qayğısına qalanı olmayan: baxımsız, adamsız. *Himayəsiz uşaq. Himayəsiz qoca.*

**HİMAYƏSİZLİK** *is.* Baxımsız, adamsız. – [Qızıl Arslan:] *Aralıqda mövcud olan bütün anlaşılmazlıq, hətta bir para ixtilaflar da himayəsizlik nəticəsində yaradılmışdır.* M.S.Ordubadi.

**HİMAYƏT** [*ər.*] *klas.* b a x **himayə**. [Yusif şah:] *Dullara və yetimlərə və şillərə və korlara ianət və himayət göstərilsin.* M.F.Axundzadə.

**HİM-CİM** b a x **him**. *Aşıq gedər hər yana; Sözün deyər mərdana; Hər qaş-gözü, himcimi; Arif gərəkdir qana.* (Bayatı). [Sərvnaz Qarakişiyə:] *Yoxsa elə bilirsən, him-cimini səndən qeyri başa düşən yoxdur*? B.Bayramov. ☐ **Him-cim eləmək** (**etmək**) – qaş-gözlə işarə etmək. *Aşıq Ələsgər nə qədər*

*him-cim eliyirsə, Musa özünü saxlaya bilmir.* "Aşıq Ələsgər".

**HİMLƏMƏ** "Himləmək"dən *f.is.*

**HİMLƏMƏK** *f.* Birinə gözü, ya əli ilə işarə etmək, him eləmək; işarə, mimika ilə bildirmək. *Osmanı himlədi əlilə bəri; Bükülü bir şeyi verdi içəri..* H.K.Sanılı. *Göz atdım gözünə, himlədim bəri! ..Dayandı şir kimi, pürvüqar gördüm.* S.Vurğun.

**HİMLƏŞMƏ** "Himləşmək"dən *f.is.*

**HİMLƏŞMƏK** *qarş.* İşarə ilə, qaş-gözlə bir-birinə bildirmək, bir-birinə him eləmək, işarə etmək. *Məclisdə oturanlar himləşdilər. – Hamı bir-birinə baxıb himləşir.* Ü.Hacıbəyov. [Gülzar] *şübhə etmirdi ki, hamı birbirilə himləşir, hamı pıçıldaşır.* İ.Hüseynov.

**HİMN** [*yun.*] 1. Dövlət və ya sinfi birlik rəmzi kimi qəbul olunmuş təntənəli mahnı.

2. Təntənəli mədhiyyə, birinin və ya bir hadisənin şərəfinə ifa edilən təntənəli musiqi əsəri. *İllərlə babalar düşmədi atdan; Zamanla bu sayaq üz-üzə durduq; Yığılıb qırmızı bayrağın altda; Yasin oxuyurduq, himn oxumurduq.* M.Araz.

**HİN**[1] *is.* 1. Bəzi ev heyvan və quşlarının saxlandığı kiçik tikili. *İt hini. Toyuqları hinə salmaq.* – [Nabat:] *Hinə bax, ay Gülsüm bacı, dünən hindən iki dənə qərib yumurta tapmışam.* C.Cabbarlı. [Eldar:] *Gedib o göyərçini hinə salım, qanadı yaralıdır, özü hinə uça bilməz.* M.Rzaquluzadə.

2. *məc. dan.* Darısqal, yöndəmsiz, natəmiz otaq, mənzil haqqında. *Bu ev deyil, hindir.*

**HİN**[2] *zərf* [*ər.*] Vaxt, zaman, çağ, an, əsna. □ **Bu hində** – bu əsnada, bu anda, bu zaman. *Bu hində yoldaşım Lağlağı əlində "Həyat"ın 106-cı nömrəsi girdi içəri..* C.Məmmədquluzadə. *Bu hində cəhənnəmdə gördüyüm bəy özünü məclisə yetirir.* Ə.Haqverdiyev.

**HİND-AVROPA: Hind-Avropa dilləri** *dilç.* – Hind, İran, yunan, slavyan, Baltik, german, kelt, roman və b. müasir və qədim Asiya və Avropa dillərinin daxil olduğu böyük dil qrupu. □ **Hind-Avropa dilçiliyi** – Hind-Avropa dillərinin müqayisəli-tarixi üsulla tədqiqi, müqayisəli-tarixi dilçilik.

**HİNDXORUZU** *is.* Erkək hinduşka, hinduşkanın xoruzu.

**HİNDİ** *is.* Amerika qitəsinin, Cənubi və Şimali Amerikanın ancaq bəzi rayonlarında qalan ən qədim yerli əhalisini təşkil edən tayfa və xalqların ümumi adı. *Qoca hindin bir hıçqırıq varmış səsində; Üfüqlərdə səslənirkən oyanan dağlar.* A.İldırım.

**HİNDLİ** *is.* Hindistanın milli, dini və kasta mənsubiyyətindən asılı olmayaraq əsil yerli əhalisinin ümumi adı; hindu; hindistanlı. *Qan damladı fırtınanın odlu gözündən; Üsyan edən hindlilərin kəskin başları; Axdı Qanqın qan ləkəli coşqun üzündən.* A.İldırım.

**HİNDŞÜNAS** *is.* [hind və *fars.* ...şünas] Hindşünaslıq mütəxəssisi.

**HİNDŞÜNASLIQ** *is.* Hindistanın tarixini, iqtisadiyyatını, dillərini, incəsənətini və s. öyrənən elmlərin toplusu.

**HİNDTOYUĞU** *is.* Dişi hinduşka, hinduşkanın toyuğu.

**HİNDU** b a x **hindli**. [Şeyx Sənan günəşi göstərir:] *Türk, hindu, ərəb, əcəm bilməz; Nuri hər yanda artar, əksilməz...* H.Cavid. □ **Hindu xal** – hindli qadınların adətən üzlərinə (daha çox alınlarına) qoyduqları xal, qara xal (əsasən klassik şeirdə). *Müəttər saçını, hindu xalını; Yetirdi hər dərdim dəvayə, pəri!* M.P.Vaqif. *Yusifin atdığı zoğalın biri* [Şahpərinin] *geniş ağ alnına dəyib əzildi, qızın çatma qaşları arasına hindu xal qoydu.* B.Bayramov. **Hindu xallı** – üzündə, ya alnında qara xal olan, qara xallı. *Qara telli, hindu xallı Məşuqənin al yanaqlarında ani olaraq bir solğunluq gəzdi.* S.Rəhimov.

**HİNDUŞKÁ** *is.* [*rus.*] Qırqovul ailəsinə mənsub ətlik iri ev quşu; loş. *Hinduşka əti. Hinduşka ferması. – Gülsəhər Müşgünazgilin qapısını döyəndə həyətdəki qazlar çığırışdı, hinduşkalar bərkdən səs elədi.* Ə.Vəliyev. *Gözünü yumub qulaq asırsan, gah elə bilirsən otağa bir sürü xoruz-toyuq dolub, gah da sənə elə gəlir ki, ətrafında qaz, ördək, hinduşka gəzir.* S.Rəhman.

**HİNLƏMƏ** "Hinləmək"dən *f.is.*

**HİNLƏMƏK** *f.* Hinə salmaq. *Göyərçinləri hinləmək.* – [Oddamdı:] *Atam, mən gedim, toyuq-cücəni hinləyim, yoxsa ara qarışar.* C.Cabbarlı.

**HİPÉRBOLA** [*yun.*] *riyaz.* Səthin konusunu kəsən ikitərəfli, qeyri-qapalı əyri xətt.

**HİPERBOLİ́K** *sif.* [*yun.*] *riyaz.* Hiperbolaya aid. *Hiperbolik kəsik.*

**HİPERBOLÓİD** [*yun.*] *riyaz.* Hiperbolanın fırlanmasından hasil olan səth.

**HİPERTÓNİK** [*yun.*] *tib.* Hipertoniya xəstəliyi olan, qan təzyiqi normadan yuxarı olan adam.

**HİPERTONİ́K** *sif.* [*yun.*] *tib.* Hipertoniyaya, qan təzyiqinin artmasına aid olan, onunla bağlı olan. ☐ **Hipertonik xəstəlik** – arteriya damarında qan təzyiqinin artması nəticəsində baş verən xəstəlik.

**HİPERTONİ́YA** [*yun.* hyper və tonus – gərginlik] *tib.* 1. Qan təzyiqinin artması.

2. Hipertonik xəstəlik, qan təzyiqinin artması.

**HİPNOTİ́ZM** [*fr.* əsli *yun.*] 1. Hipnoza xas olan halların məcmusu.

2. B a x **hipnoz** 1-ci mənada.

3. Başqasına təsir etmək bacarığı.

**HİPNÓZ** [*yun.* hypnos – yuxu] 1. İnsanda və ali onurğalı heyvanlarda adətən sözlə, baxışla təlqin nəticəsində əmələ gələn yarımyuxululuq halı. *Kütləvi hipnoz və müxtəlif "möcüzələr" göstərmək ta qədimdən məlum olan adi bir şeydir; hind sehrbazları bunu xüsusilə bacarırmışlar və indi də bacarırlar.* Ə.Haqverdiyev. ☐ **Hipnoz etmək** – b a x **hipnozlamaq**.

2. Təlqin vasitəsilə yatırtma, habelə yatırdılanın iradəsinə (müalicə məqsədilə) təsir göstərmə; hipnozla müalicə. // *məc.* Cazibə, cazibə qüvvəsi. *Hipnoz kimi təsir etmək.*

**HİPNOZÇU** *is.* Başqasını hipnoz halına gətirən adam; hipnozla müalicə edən həkim.

**HİPNOZLAMA** "Hipnozlamaq"dan *f.is.*

**HİPNOZLAMAQ** *f.* Təlqin vasitəsilə hipnoz vəziyyətinə gətirmək, hipnoz etmək. *Xəstəni hipnozlamaq.* // *məc.* İradəsini əlindən almaq, sezdirmədən öz iradəsinə tabe etmək, öz təsiri altına salmaq.

**HİPOTENÚZ** [*yun.*] *riyaz.* Düzbucaqlı üçbucağın düz bucaq qarşısındakı tərəfi.

**HİPOTONİ́YA** [*yun.*] *tib.* Qan təzyiqinin azalması, aşağı düşməsi; habelə toxumaların, orqanların tonusunun azalması.

**HİRS** *is.* [*ər.*] Qəzəb, hiddət, acıq, qeyz. *İzzət qüssədən və Məhəmmədhəsən əmi hirsindən başladılar Əhməd kimi ağlamağa.* C.Məmmədquluzadə.

◊ **Hirs bağırsaqlarını (bağırsağını) kəsmək** – bərk hirslənmək, hiddətlənmək, qəzəblənmək. **Hirsi təpəsinə (başına, kəlləsinə) vurmaq** – bərk hiddətlənmək, çox hirslənmək, qəzəblənmək. *Cümşüd bəy qulaq asdı, qulaq asdı, hirsi təpəsinə vurdu və birdən-birə səsini ucaldıb dedi..* E.Sultanov. **Hirsi tutmaq** – hirslənmək, qəzəblənmək, acığı tutmaq. [Sultan bəy:] *Mənim də hirsim tutar, vurub öldürərəm.* Ü.Hacıbəyov. **Hirsi yatmaq, soyumaq** – hirsi keçmək, qəzəbi keçmək, sakitləşmək. *Xan eşikağasının sözlərindən mütəəssir olub, hirsi yatdı.* Çəmənzəminli. *Sədrin hirsi soyudu.* S.Rəhimov. **Hirsindən dodaqlarını (zəncir, cilov) çeynəmək (gəmirmək)** – çox bərk hirslənmək, qəzəblənmək. *Mahmud hirsindən dodaqlarını çeynəyib, öz kişiliyini göstərməyi və arvadı evdə kötəkləməyi qət etdi.* B.Talıblı. **Hirsindən qovrulmaq** – hirsindən, acığından nə edəcəyini bilməmək, hirs boğmaq. **Hirsini basmaq (boğmaq, yemək)** – hiddətini, hirsini yatırtmaq, özünü saxlamaq, hirsini, acığını büruzə verməməyə çalışmaq. *Ha adam istəyir hirsini yesin, dinməsin, insanı öz başına qoymurlar, dindirirlər.* C.Məmmədquluzadə. *Elman hirsini boğub, Ceyran xanımın dalınca baxdı.* M.Hüseyn.

**HİRSLƏNDİRMƏ** "Hirsləndirmək"dən *f.is.*

**HİRSLƏNDİRMƏK** *f.* Qəzəbləndirmək, hiddətləndirmək; qəzəblənməsinə, hirslənməsinə səbəb olmaq; qeyzləndirmək.

**HİRSLƏNMƏ** "Hirslənmək"dən *f.is.*

**HİRSLƏNMƏK** *f.* Hiddətlənmək, qəzəblənmək, qızışmaq, acığı tutmaq. *Uşağa hirslənmək. Eşitdiyi sözdən hirslənmək.* – [Şiraslan] *Dadaş Lələşovu görüb hirsləndi, tez dönüb Ağbulaq kəndindən çıxdı.* S.Rəhimov. *Tapdıq bir qədər hirslənmişdi. Onu evə çağırmadıqlarına görə ata və anasına çox acığı tutmuşdu.* Ə.Vəliyev.

**HİRSLİ** *sif.* 1. Hiddətli, acıqlı, qəzəbli, hirslənmiş. *Hirsli kişi.* – [Məşədi Qəzənfər:]

*Məşədi, sənin bu aşnaların nə hirsli adamlardır?* Ü.Hacıbəyov. [Mahmud] *hirsli arvaddan əvvəlcə qorxdu.* Ə.Əbülhəsən. // *zərf* Hirsli-hirsli. *Hirsli danışmaq. Hirsli cavab vermək. – Nazir yerindən durmayıb, üzünü Salmana tutub hirsli soruşdu..* Ə.Haqverdiyev. *Övrət hirsli girir ərinin otağına və başlayır bu cür məzəmmət eləməyə: – A kişi, sən olasan Allah, bu kitabları və kağızları tulla cəhənnəmə.* C.Məmmədquluzadə. // Hirs, acıq, qəzəb ifadə edən; qəzəbli, acıqlı. *Hirsli nəzər. Hirsli görkəm. – Geniş açılmış qırpımsız, hirsli gözləri gördükdə* [arvada] *elə gəldi ki, kişi heç bir an da yatmayıb.* İ.Hüseynov.

2. *məc.* Şiddətli, kəskin, coşqun. *Hirsli hava. Hirsli dəniz. – Axşamdan bəridir könlümdə yenə; Hirsli fırtınalar, qasırğalar var.* S.Vurğun.

**hirsli-hirsli** *zərf* Hirsli halda, qəzəbli-qəzəbli, hiddətlənərək, acıqlı-acıqlı; qəzəblə, hirslə, hiddətlə. *Hirsli-hirsli danışmaq. – Qara bəy hirsli-hirsli Oruca baxdı.* Ə.Vəliyev. [Rəşid:] *Canbalayevin hirsli-hirsli bir-birinə sıxılmış dodaqları, zəhmli gözləri təsəvvürümdən silinmirdi.* İ.Hüseynov.

**HİS** *is.* 1. Yanan bir şeydən çıxan kəsif tüstü. *Ocağın hisi. Tonqalın hisi. – Yel əsdikcə fənərin hisi artdı, işığın dairəsi getgedə kiçildi, zəiflənən alov qaranlığın qüvvətli pəncəsində boğuldu..* S.Rəhimov.

2. Həmin tüstüdən əşyaların üzərinə qonan qara çöküntü; qurum. *Pəncərənin hisini təmizləmək. – Sağ tərəfdə isə taxtası köhnə və hisdən qaralmış bir qapı vardır.* H.Nəzərli. *Yazısı pozulmuş kağız hisdən sapsarı saralmışdı.* B.Bayramov. ◻ **His basmaq (bağlamaq)** – üzərində qurum əmələ gəlmək, hisdən qaralmaq. [Qəhrəmanın] *fikri yenə də dolana-dolana hərəkət edir, .. ağacları his bağlamış damda dayanırdı.* S.Rəhimov. *Mətbəxin divarlarını his basmışdı.* Ə.Sadıq.

**HİSXANA** *is.* Balıq, ət və s. hisə verilən yer, sex və s.

**HİSLƏMƏ** 1. *is.* Balığı, əti və s. saxlamaq üçün hisə verərək qurutma. *Balıq emalında elektriklə hisləmə üsulu tətbiq edilməkdədir.*

2. "Hisləmək"dən *f.is.*

**HİSLƏMƏK** *f.* 1. His buraxmaq, his eləmək, az tüstüləmək. *Pilətə hisləyir. Külün içində gözlər hisləyir.*

2. Hisləmə üsulu ilə qurutmaq (b a x **hisləmə** 1-ci mənada).

**HİSLƏNMƏ** "Hislənmək"dən *f.is.*

**HİSLƏNMƏK** *f.* 1. Tüstülənmək, yaxşı yanmadığından his buraxmaq. *Tonqal hislənir. Ocaq hislənirdi. – Əhməd şüşəsi hislənmiş* (f.sif.) *lampanın fitilini aşağı çəkib, işığı öləzitdi.* İ.Şıxlı.

2. His çəkmək, hisə bulanmaq, hisdən qaralmaq. *Lampanın şüşəsi hislənmişdir. – Babalarımızın bu köhnə "imarət"ə* (*qara dama*) *nədən "qara" adı verdiyini bilirsinizmi? İki şeydən: biri, üstünə tökülən qara torpaqdan, o biri, tüstüdən içərisi hislənib, qurum tutaraq qaralmağından.* S.S.Axundov.

**HİSLİ** *sif.* 1. His verən, yaxşı yanmayıb his eləyən; tüstülənən. *Hisli təndir. – Dağ başı səsli qalar; Ocağı hisli* (z.) *qalar; Yemək ilən dost olan; İllərlə küslü qalar.* (Bayatı). *Hisli lampanın işığında bir neçə adam işləyirdi.* Q.İlkin.

2. His çəkmiş, his basmış, hisdən qaralmış, hislə örtülmüş. *Hisli qazan. Hisli tava. – Kürsünün altında var: üzüqoylu çevrilmiş bir qazan, bir çanaq, içində qatıq, bir qara, hisli çaydan.* C.Məmmədquluzadə.

**HİSLİ-PASLI, HİSLİ-TOZLU** *sif. dan.* His-pas (his-toz) basmış, hisli; çirkli. *Hisli-paslı* (*hisli-tozlu*) *qapı. Hisli-paslı* (*hisli-tozlu*) *otaq.* – [Mahmud:] *Axı bura xalis behiştdir, o hisli-paslı daxmada nə görübsən?* Ə.Haqverdiyev. [Bayram kişi:] *Çox adam bizim bu qumlu bağları, hisli-tozlu* [Abşeronu] *bəyənmir.* M.Rzaquluzadə. // *məc.* Kirli, çirkli; üz-gözünü, üst-başını çirk basmış. *Hisli-paslı uşaq.*

**HİS-PAS** *top. dan.* His çirk, kir. *Qazanın his-pasını yumaq. – Hisdən-pasdan qaralıb sifətini itirmiş .. taxta bufet, kim bilir, neçə nəsli o dünyaya ötürmüşdü.* B.Bayramov.

**HİSS** *is.* [*ər.*] 1. B a x **duyğu**. [Rüstəm bəy Sofya xanıma:] *Hiss təbiət zəkasının təzahürüdür, təbiət istədiyini hiss vasitəsilə görür.* Çəmənzəminli. *Səbrlə, tədbirlə ölçüb-biçmədən; Ağla güvənmədik, hissə güvəndik.* B.Vahabzadə. *Görən doğrudanmı*

*insan qəlbinin; İncə hisslərinə toxunmur şeir?* M.Araz. ☐ **Hiss etmək** – bax **duymaq**. *Aclıq hiss etmək. – Əri Cavad tamam qışı xəstə yatıb, indi isə qıçlarında bir qədər qüvvət hiss edib dedi..* Ə.Haqverdiyev. [Əminə:] *Heyrətindən şillənin ağrı-acısını belə hiss etmədi.* Ə.Əbülhəsən.

2. *məc.* Sevgi, məhəbbət. *Hadisə Qadiri elə çaşdırmış, ruhunu və qəlbini elə sıxmışdı ki, elə bil, o gözəl qıza olan hissi və duyğuları da indi onun yadından çıxmışdı.* Ə.Əbülhəsən.

3. Öz duyğuları, təəssüratı əsasında bir şeyi apaydın, həssaslıqla qavrama, dərketmə bacarığı. *Gözəllik hissi. – Güman olunmasın ki, Münəvvər xanımda qadınlara xas olan qısqanclıq hissi zəif idi.* Mir Cəlal. ☐ **Hissə qapılmaq** – bax **hissiyyata qapılmaq** (“**hissiyyat”**da). *Şirzad hissə qapılan, yəni, Salmanın dediyi kimi, qəlbən şair idi. Hissə qapılanda da ürəyi yaz səhərinin üfüqləri kimi açılırdı.* M.İbrahimov. [Səlim:] *Hissə qapılmaq məndə də var, Zərnişan!* B.Bayramov.

**HİSSƏ** *is.* [*ər.*] 1. Tamın bölündüyü parçalardan hər biri; qisim. *Binanın bir hissəsi. Çayın aşağı hissəsi. – Şirvan Şimali Azərbaycanın bir hissəsidir.* M.S.Ordubadi. [Kiçikbəyim] *günün müəyyən hissəsində şəhərin ətrafını dolanırdı..* Çəmənzəminli. *– Mən ki sənəm, mən ki sənəm; tanımadın? Dəfn olunmuş bir hissənəm; tanımadın?* M.Araz. // Bölünən bir şeydən hərəyə düşən pay. *Hərə öz hissəsini götürdü. Onun hissəsini ayırıb verin.*

2. Vahid, tam bir sistemin (orqanizmin, mexanizmin və s.) tərkib elementlərini təşkil edən şeylərdən hər biri. *Ehtiyat hissələri. Maşın hissələri. – Şofer .. motorun əvəz edilməsi lazım gələn hissəsini alıb gətirmək üçün getmiş, təsadüfən oradan keçən başqa bir maşınla geri qayıtmışdı.* S.Hüseyn. *Çatışmayan və yaxud düzəldilməyi vacib olan bəzi hissələr Keşlədə hazırlanırdı.* H.Seyidbəyli. // Hər hansı əsərin üzvi parçası, qismi, fəsli. *Romandan bir hissə. Sonatanın son hissəsi. –* [Seymur] *rəssamlıq məktəbinə gəlib, birbaş tədris hissə müdirinin otağına girdi.* H.Seyidbəyli.

3. Əlahiddə qoşun vahidi. *Aviasiya hissəsi. Tank hissəsi. Hissə komandiri. – Doğrudur, bir dəfə Rüstəm kişi ayağından yaralandı, lakin sağalıb yenə hissəsinə qayıtdı.* M.İbrahimov. *İstehkam hissələrinin əlində kifayət qədər vəsait olmurdu.* Mir Cəlal.

**hissə-hissə** *sif.* və *zərf* Tam, bütöv halda deyil, hissələrə ayrılmış halda; hissələrlə, tikə-tikə. *Tarlanı hissə-hissə şumlamaq. Romanı hissə-hissə çap etmək. – Qoşun hissə-hissə olub istirahət edirdi.* S.Rəhimov. *Heç şey hissə-hissə ölümə təslim olan bir bədəni yaşada bilməyəcəkdi.* M.İbrahimov.

**HİSSƏCİK** *is.* Bir şeyin ən kiçik, cüzi hissəsi, parçası. *Çox kiçik cisim, başqa sözlə, hissəcik anlayışı nisbi anlayışdır.* Z.Xəlilov. *Atom, maddənin kimyəvi reaksiyalarda bölünməyən ən kiçik hissəciklərinə deyilir.* C.Zülfüqarlı.

**HİSSİ** *sif.* [*ər.*] Hiss orqanları, duyğu, qavrama vasitəsilə əmələ gələn, törəyən, hisslə dərk olunan. *Hissi qavrayış. Hissi təəssürat.* // Hissə, duyğuya aid olan. *Mərkəzi, yaxud birləşdirici neyronlar .. oyanmanı, hissi neyronlardan hərəki neyronlara keçirir.* “Psixologiya oçerkləri”. // *məc.* Cismani, şəhvani. *İnsanda hissi təmayüllər.*

**HİSSİYYAT** *is.* [*ər.* “hiss” söz. cəmi] Hisslərlə, duyğularla bağlı hallar, hissi təəssürat; hisslər, duyğular. [Yaşlı kişi:] *Gənclik hissiyyatım məni* [qadına] *tərəf çəksə də, şüurum belə bir işdən çəkinməyi mənə tövsiyə edirdi.* S.Hüseyn. *Şəxsi müşahidələr və hissiyyata əsaslanan* [Rüstəmin] *mülahizələri çox zaman doğru çıxardı.* M.İbrahimov. ◊ **Hissiyyata qapılmaq** – öz hisslərinə uymaq, tabe olmaq, hisslərinin tələbinə, xəyala, hissiyyata görə hərəkət etmək. *..Mötəsim xəlifənin katibləri Babək üsyanının cərəyanı və onun inkişafı yollarını yazarkən dini hissiyyata qapılıb, həqiqəti tamamilə təhrif ediblər.* M.S.Ordubadi.

**HİSSİZ** *sif.* 1. Hissetmə qabiliyyətindən məhrum, heç bir şey hiss etməyən, hissini, duyğusunu itirmiş; duyğusuz, bihuş. *Hissiz halda yatan xəstə. –* [Səlim] *Zeynalın sərxoşluqdan hissiz bir hala gəlmiş vücudunu bir kömür çuvalına və ya un kisəsinə bənzədirdi.* S.Hüseyn. // Key, keyləşmiş, keyləşdirilmiş.

*Hissiz dəri. – Bu gecə Əmir İnanc həddindən artıq içmişdi. İstinin şiddəti də onun sərxoşluğunu artırmış və hissiz düşüb qalmasına səbəb olmuşdu.* M.S.Ordubadi.

2. *məc.* Həyata, hadisələrə, varlığa laqeyd münasibət bəsləyən, onları dərk etməyən, heç bir şeydən təsirlənməyən; duyğusuz.

**HİSSİZLƏŞDİRİLMƏ** "Hissizləşdirilmək"dən *f.is. Dərinin* (*dişin*) *hissizləşdirilməsi.*

**HİSSİZLƏŞDİRİLMƏK** *məch.* Hissiz hala gətirilmək; keyləşdirilmək.

**HİSSİZLƏŞDİRMƏ** "Hissizləşdirmək"-dən *f.is.*

**HİSSİZLƏŞDİRMƏK** *f.* Hissiz, duyğusuz hala gətirmək, keyləşdirmək, bihuş etmək. *İynə vurub yaralı ayağı hissizləşdirmək. Xəstəni hissizləşdirmək.*

**HİSSİZLƏŞMƏ** "Hissizləşmək"dən *f.is.*

**HİSSİZLƏŞMƏK** *f.* Hissiz hala gəlmək, hissetmə qabiliyyətini itirmək, keyləşmək, bihuş olmaq.

**HİSSİZLİK** *is.* Hissin, duyğunun olmadığı hal, heç bir şey hiss etməmə; duyğusuzluq, keylik. [Mehriban] *sonra qarşısında daş bir heykəl hissizliyilə hərəkətsiz duran ərini başdan-ayağa süzdü.* S.Hüseyn.

**HİSTOLÓGİYA** [*yun.* histos – toxuma və logos – elm] İnsan və çoxhüceyrəli heyvan hüceyrələrinin quruluşu haqqında elm.

**HİSTOLOJÍ** *sif.* [*yun.*] Histologiyaya aid olan, histologiya ilə əlaqədar olan. *Histoloji tədqiqat.*

**HİSTOLÓQ** [*yun.*] Histologiya mütəxəssisi.

**HİS-TOZ** b a x **his-pas**. *His-toz basmış pəncərə. Şüşələrin his-tozunu təmizləmək. – Sentyabrda tökülən ilk payız yağışı .. yayın his-tozunu yuyub aparır..* M.İbrahimov.

**HİŞ** *təql.* Öküzü, kəli sürmək, ya saxlamaq və döndərmək üçün işlədilən nida. *Leylək .. yaşı ötən şeşəbuynuz bir öküz kimi hey irəliyə dürtülürdü, nə qədər onun burnundan vurub hiş deyilsə belə, geri çəkilmirdi.* S.Rəhimov. [Nəcəfalı:] *Saxlayın, a bala, kotan ilişdi, əyə, hiş deyin, gavahını qıracaqsınız.* B.Bayramov.

**HİTLERÇİ** Hitler tərəfdarı, alman faşisti.

**HİTLERÍZM** Almaniyada 1933-1945-ci illərdə Hitlerin başçılıq etdiyi faşist diktaturası, habelə faşist diktaturası ideologiyası.

**HİYLƏ** *is.* [*ər.*] Kələk, fırıldaq, fənd; məkr. [Şah vəzirə:] *Vəzir, bu çox qəribə işdir, yəqin burada bir hiylə vardır.* Ü.Hacıbəyov. *Satqınların hiyləsindən; Neçə kərə; Tarix endi zirvələrdən dərələrə.* B.Vahabzadə.

◊ **Hiylə qurmaq (düzəltmək)** – biclik işlətmək, kələk qurmaq. [Rüstəm bəy:] *Cürbəcür hiylə qurmuşam.* S.S.Axundov. **Hiylə işlətmək (gəlmək)** – hiylə ilə aldatmaq, yalan deyərək aldatmaq, biclik gəlmək. *Vəzirin qızları hiylə işlədərək padşahın oğlanlarının onlara sataşdıqlarını analarına söylədilər.* (Nağıl). [Şeyx Haşimi İbn-Xalidə:] *Mən o sülh qasidinə inanmıram, Nofəl hiylə işlədir.* Ə.Məmmədxanlı.

**HİYLƏBAZ** [*ər.* hiylə və *fars.* ...baz] b a x **hiyləgər.** *Hiyləbaz adam.* – [Qarı:] *O işi də mənə tapşır, qızım. Ərin hiyləbazdırsa, mən ondan hiyləbazam.* E.Sultanov.

**HİYLƏBAZLIQ** b a x **hiyləgərlik**.

**HİYLƏGƏR** *sif.* [*ər.* hiylə və *fars.* ...gər] 1. Hiylə işlədən, kələkbaz, fəndgir, bic, məkrli. *Hiyləgər adam.* – [Nüşabə:] *Düşmən həm güclüdür, həm də hiyləgər; Qüvvətlə, hiyləylə qazanır zəfər.* A.Şaiq. *Dünyanın ən hiyləgər, mahir kələkbazları; Saat ilə təqvimə əl qata bilmədilər; Yalnız vaxtı, zamanı aldada bilmədilər.* B.Vahabzadə. // *məc.* Eyni mənada bəzi heyvanlar haqqında. *Hiyləgər tülkü. – Görünür ki, kəndə dadanmış bu qurd çox təcrübəli və hiyləgər bir qurd idi.* M.Rzaquluzadə.

2. Hiylə ifadə edən. *Hiyləgər baxış. – Cəfər hiyləgər bir təbəssümlə göz vurdu və qonaqları sakit eləyə-eləyə*: *– Qardaş, hər sirr Allah yanındadır,* – [dedi] Çəmənzəminli.

**HİYLƏGƏRCƏSİNƏ** *zərf* Hiylə ilə, məkrlə, ibliscəsinə; bic-bic. *Müqim bəy hiyləgərcəsinə dodaqlarını büzüb*: *– Qız, sənə nə olub, gözlərin belə qırmızı almaya dönüb?* – dedi. S.Rəhimov. *İbiş hiyləgərcəsinə gülümsündü.* S.Vəliyev.

**HİYLƏGƏRLİK** *is.* Hiyləbazlıq, biclik, kələkbazlıq, fəndgirlik, məkrlilik. *Ana zəifdir, lakin dünyanın güclülərinin və zalımlarının hiyləgərliyi və fırıldaqçılığına*

*qarşı onun qüdrətli silahı təmizlik və düzlükdür.* M.İbrahimov. *Ancaq əslində Gülpərinin üz-gözündən adi bir hiyləgərlik tökülürdü.* M.Hüseyn.

**HİYLƏSİZ** *sif.* və *zərf* Hiylə olmadan, hiylə işlətmədən, düzlüklə, doğru yolla. *Hiyləsiz adam. Hiyləsiz işi görmək. – Alqış o boyasız, rəngsiz üzünə! Alqış o hiyləsiz təmiz sözünə!* S.Vurğun.

**HM** *nida.* 1. Şübhə, istehza bildirir. *Hm, sən də orada idin?*

2. Bir söz demək istərkən çətinlik çəkdikdə və ya tərəddüd etdikdə işlənir – hə.

**HO, HO-HO** *təql.* İşlək qaramalı hərəkətə gətirmək və ya qovmaq üçün işlədilir. *Ho-ho! – deyə alçaqboylu, çalsaqqallı, gün altında işləməkdən əl və üzü qaralmış arabaçımız Səməd kişi öküzləri səslədi.* T.Ş.Simurq. *Arabaçı tez-tez çubuğunu şaqqıldadır, "ho-ho, hiş" – deyə heyvanları səsləyirdi.* İ.Şıxlı.

**HODAQ** *is. məh.* Kotana qoşulan öküz. *Qəhrəman .. hodaq sürməkdə .. Rüstəmə kömək edirdi.* S.Rəhimov. *Poladı qaytarıb kotan hodağı sürməyə göndərdilər.* Ə.Vəliyev.

**HODAQÇI** *is. məh.* Kotana qoşulan öküzün başını çəkən adam. *Hodaqçılar* [aqronomun] *böyük adam olduğunu düşünüb, öküzləri yana vurdular.* B.Bayramov.

**HO-HA, HO-HO** b a x **ho**. *Ho-ho var dağa qaldırar, ho-ho var dağdan endirər.* (Məsəl). *Məşədi Ağakişi gedib çıxır vəlin üstə və "ho-ho" deyə-deyə başlayır öküzləri sürməyə.* C.Məmmədquluzadə. *Faytonçu "hoha, ho-ho" – deyə gah adamları, gah atları haylayır, qırmancını havada oynadırdı...* M.İbrahimov.

**HOHOLAMA** "Hoholamaq"dan *f.is.*

**HOHOLAMAQ** *f. dan.* İnəyi, öküzü, keli hərəkətə gətirmək və ya yerişini artırmaq üçün "ho-ho" deyə səs çıxarmaq. *Tərxan .. əlində nar çubuğu irəli keçirdi və ağır tərpənişli öküzləri hohalayırdı...* Ə.Məmmədxanlı.

**HOQQA**[1] *is.* [*ər.*] 1. Əl zirəkliyi ilə çıxarılan cürbəcür oyunlar.

2. *məc.* Kələk, fırıldaq, fənd, hiylə. *Bu nə hoqqadır? Hoqqası baş tutmadı. Başdan-ayağa hoqqadır.* – [Salamov Bahadır bəyə:] *Hamısı badalaqdır, bütün hoqqalar mədənlər üstündədir.* C.Cabbarlı.

◊ **Hoqqa çıxarmaq (bəzəmək)** – oyun çıxarmaq, oyunbazlıq etmək. [Mirzə Səməndər Almaza:] *..Əyər müdir mənəm, bu nə hoqqadır bəzəyirsən?* C.Cabbarlı. [İnci:] *Namusla səkkiz saat işləmisən, qurtarıb. Daha istirahət günü işləyib özündən hoqqa çıxartma.* S.Rəhman.

**HOQQA**[2] *is.* [*ər.*] *köhn.* Tiryək çəkənlərin işlətdiyi xüsusi qəlyan və onun başına keçirilən borucuq. *..İki uşaq bu dəfə iki podnosda firuzə başlı hoqqa və maşa gətirdi..* M.S.Ordubadi. *Keyfini pozmaz, onun tiryəki var, hoqqası var.* Ə.Nəzmi.

**HOQQABAZ** *is.* [*ər.* hoqqa və *fars.* ...baz] 1. Əl cəldliyi ilə cürbəcür oyunlar göstərən adam, hoqqa çıxardan; oyunbaz. *Şad günümüzdə .. bizə mütrüblər, hoqqabazlar, kəndirbazlar, meymunoynadanlar, ayıoynadanlar göndərir.* Ə.Haqverdiyev. [Mirzə Qulam] *..özünə xam məclis tapmış hoqqabazlar kimi sevinə-sevinə danışdı..* Mir Cəlal.

2. *məc.* Kələkbaz, fırıldaqçı, haramzadə. [Nəbi:] *Vəfalı oğlundan şübhə yaramaz! Yəqin yalan satıb sənə hoqqabaz.* S.Rüstəm.

**HOQQABAZLIQ** *is.* 1. Hoqqabazın (1-ci mənada) işi, sənəti; əl zirəkliyi ilə cürbəcür şeylər göstərmə. *Qəhqəhə, əlçalanların qarışıq ovuc səsləri, Zeynalın əlli cürə hoqqabazlığı .. məclisi xeyli şənləndirib qızışdırdı.* Ə.Əbülhəsən. // Oyunbazlıq. [Firəngiz Muxtara:] *Yeniliyi sənin kimi astarından anlayanlar .. hər cür hoqqabazlığı .. yenilik adlandırırlar.* B.Bayramov. □ **Hoqqabazlıq etmək** – hoqqa çıxarmaq, oyun çıxarmaq, oyunbazlıq etmək, təlxəklik etmək, özünü təlxək kimi aparmaq.

2. *məc.* Yalanla, hiylə ilə, aldadıcı yollarla görülən iş. *Oynadar əldə məzhəbi, dini; Hoqqabazlıqda xeyli kamildir.* M.Ə.Möcüz.

**HOLAVAR** *is. folk.* Cütçülərin, əkinçilərin oxuduqları mahnı (şifahi xalq ədəbiyyatı növü). *Kotançıların holavarları, otbiçənlərin çobanbayatısı .. Budağı valeh etmişdi.* Ə.Vəliyev. *Kəndin yaxınlığındakı çaylaqlarda çəltik üçün yer əkən cütçülərin holavar səsi də bir tərəfdən yüksəlirdi.* Ə.Abasov. □ **Holavar çəkmək** – b a x **holavarlamaq**.

*Təcrübəli əkinçilərdən hərəsi bir kotanın dəstəyindən yapışır, cavanlar holavar çəkirdilər.* B.Bayramov.

**HOLAVARLAMA** "Holavarlamaq"dan *f.is.*

**HOLAVARLAMAQ** *f.* Holavar oxumaq, holavar çəkmək. [Qoca:] *Ay balam, niyə Allahın gözündən düşmüsən, bir holavarla, qoy öküz işin cəmini tapsın, – dedi.* S.Rəhimov.

**HOLL** [*ing.*] İctimai binalarda istirahət və ya gözləmə üçün böyük otaq, zal, salon.

**HOLLAND, HOLLANDİYALI** *is.* Hollandiyanın (Niderlandiyanın) əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**HOLLANDCA** *sif.* və *zərf* Holland dilində. *Hollandca-azərbaycanca lüğət. Hollandca öyrənmək.*

**HOMEOPÁT** [*yun.*] Homeopatiya üsulları ilə müalicə edən həkim.

**HOMEOPATÍK** *sif.* [*yun.*] Homeopatiya ilə bağlı olan, homeopatiya üsulları tətbiq edən. *Homeopatik müalicə.*

**HOMEOPÁTİYA** [*yun.* homoios – oxşar, bənzər və pathos – xəstəlik] Böyük dozaları sağlam adamda müalicə edilən xəstəlik əlamətlərinə oxşar əlamətlər törədən dərmanların çox kiçik dozaları ilə müalicə üsulu.

**HOMOGEN** *sif.* [*yun.*] Eyni cinsli, bir cinsli.

**HOMOSEKSUALÍZM** [*yun.* homos – oxşar, bənzər və *lat.* sexualis – cinsi] Öz cinsindən olan adama qeyri-təbii cinsi meyil.

**HOP** *təql.* Birdən və cəld qalxıb sıçramağı anladır. *Hop yerindən sıçradı. Hop qalxdı.* // *Zərf mənasında.* Birdən, o saat, cəld, dərhal, bir anda. ☐ **Hop eləyib yemək** – birdən, cəld udmaq, yemək; içəri ötürmək. [Əsəd bəy:] *Halva deyil ki, hop eləyib yesinlər.* C.Cabbarlı. **Hop götürmək** – tez qaldırıb götürmək, qamarlayıb götürmək. *Fəhlələr* [Mehmanı] *hop götürdülər və buruqdan iyirmi beş-otuz addım kənarda duran maşına tərəf apardılar.* M.Hüseyn. *Kabı kişi qəti addımlarla uşağa yaxınlaşdı, onun qoltuğundan hop götürüb masanın üstünə qoydu.* İ.Şıxlı.

**HOPDURMA** "Hopdurmaq"dan *f.is.*

**HOPDURMAQ** *f.* Tədricən canına çəkmək, sormaq, udmaq. *Torpaq suyu yaxşı hopdurur. – Gil layları gil məhlulu suyunu hopdurmadığına görə, quyu qazılarkən bu laylar dövr edən gil məhlulu ilə yuyulur və quyu gövdəsinin diametri genəlir.* "Neftmədən geologiyası".

**HOPDURMAYAN** *sif.* Rütubəti, suyu canına çəkməyən, su keçməyən, su buraxmayan. *Su hopdurmayan parça.*

**HOPDURUCU** *sif.* Hopma qabiliyyəti olan, canına çəkən, soran. *Hopdurucu lay. Hopdurucu maddə. Hopdurucu torpaq.*

**HOPDURULMA** "Hopdurulmaq"dan *f.is.*

**HOPDURULMAQ** "Hopdurmaq"dan *məch.* [Natiq] *ətir hopdurulmuş* (f.sif.) *dəsmalını çıxarıb, .. qulaqlarının dalında gəzdirdi.* B.Bayramov.

**HOP-HOP** bax **şanapipik**. *Bu oxuyan quş hop-hopdur; Qulaq asın siz hop-hopa.* M.Dilbazi.

**HOPLAŞMA** "Hoplaşmaq"dan *f.is.*

**HOPLAŞMAQ** *qarş.* Atılıb-düşmək, oynaşmaq. *Uşaqlar hoplaşırdılar. – Ətrafında qoyun-quzu hoplaşar; Oynar, coşar, mələr, yenə toplaşar.* H.Cavid.

**HOPLATMA** "Hoplatmaq"dan *f.is.*

**HOPLATMAQ** *f. dan.* Atıb-tutmaq, oynatmaq. *Uşağı hoplatmaq.* – [Şeyx Sənan yuxuda gördüyü şeyx haqqında:] *Sanki bir tifl idim... Qucaqlayaraq; Bir zaman öpdü, sevdi, hoplatdı.* H.Cavid.

**HOPMA** "Hopmaq"dan *f.is. Meşələr qarın tez əriməsinə mane olur, yerüstü suların axmasını azaldır ki, bu da rütubətin torpağa hopmasına səbəb olur.* M.Qaşqay.

**HOPMAQ** *f.* Canına, içinə keçmək; sorulmaq. *Su torpağa yaxşı hopur. – Hopduqca səhranın gövdəsinə su; Tərlədi qaxsımış bir bədən kimi.* S.Vurğun. *İlk nəzərdə bu meşəliyin mənzərəsi ürəksıxıcı idi, taxtaşalbanına başdan-başa mazut hopmuşdu..* İ.Qasımov. // *məc.* Nüfuz etmək. *Birdən bu son işıq zərrələri də elə bil zülmətə hopur, aləm yenə də qaranlığa cumurdu.* Ə.Əbülhəsən. *Hopdu ruhumuza bayatılardan; Nəğməyə bənzəyən ləhcələrimiz.* B.Vahabzadə.

◊ **Qanına-canına hopmaq** – bax **qanına yerimək (keçmək, işləmək)** 2-ci mənada ("**qan**"da).

**HOPPA** *təql.* Balaca uşağı qoltuqlarından, ya qollarından tutub hoppandırdıqda deyilən söz.

**HOPPANDIRMA** "Hoppandırmaq"dan *f.is.*

**HOPPANDIRMAQ** *f.* Atlandırmaq. *Bizlərdə qorxaq atı çaydan hoppandırmaq üçün belə tələsik çıxan .. səslərlə acıqlanarlar.* Mir Cəlal.

**HOPPANIŞ** *is.* Hoppanma işi; hoppanma, atlanma, tullanma, atlanış. *Bir hoppanışla arxı keçmək.*

**HOPPANIŞMA** "Hoppanışmaq"dan *f.is.*

**HOPPANIŞMAQ** *qarş.* Hoppanmaq, atılmaq, atlanmaq, sıçraşmaq (çoxları haqqında). *Uşaqlar təpədən hoppanışdılar.* – [Nərgiz] *hürküşüb suya hoppanışan* (f.sif.) *qurbağalara tamaşa elədi.* B.Bayramov.

**HOPPANMA** "Hoppanmaq"dan *f.is. Pərdə qalxanda iki əcinnə üstdən hoppanma oynayırlar.* Ə.Haqverdiyev.

**HOPPANMAQ** *f.* 1. Atlanmaq, tullanmaq, sıçramaq, atılmaq. *Sanki canavar bir adamın üstünə hoppanmaq və qanını sormaq istəyirdi.* M.S.Ordubadi. *Nökər birdən hoppanıb, İsrafilin belindən yapışdı..* M.Hüseyn. // *məc.* Çox sevinmək, şadlığından özündən çıxmaq, atılıb-düşmək (bəzən "sevincindən", "şadlığından" sözləri ilə). *Orxana elə gəldi ki, bu qızın işi-peşəsi dağ keçisi təki qayalara dırmaşmaq, daşdan-daşa hoppanmaqdır.* İ.Məlikzadə.

2. Bir şeyin üstündən atlanıb keçmək; aşmaq, atlanmaq, sıçramaq. *Arxın üstündən hoppanmaq.* – [Hatəmxan ağa:] *Rüsxət verməsəm* [Şahbaz bəy] *atılar, minər atına, hoppanar Arazın o tayına, sonra mən onu haradan tapım?* M.F.Axundzadə. *Baxın, hər qapıda bir tonqal yanır; Uşaqlar hoppanır od-alov üstdən.* S.Vurğun.

**hoppana-hoppana** *zərf* Hoppanaraq, sıçrayaraq, atlanaraq, atlana-atlana. *Hoppana-hoppana pilləkənləri çıxmaq.* – *Üzü sarıqlı* [şəxs] *qoltuqlarında iki çəlik, qarğa kimi hoppana-hoppana mənə tərəf gəlirdi.* Ə.Haqverdiyev.

**HOR** *dan.* b a x **hovur**. [Çopo:] *Ceyniz biriki hor söhbət eləyib, ayağa durdu.* Çəmənzəminli.

**HORMON** [*yun.* hormaino – hərəkətə gətirirəm] *fiziol.* Daxili sekresiya vəzilərinin hazırladığı (və qana ifraz etdiyi) aktiv fizioloji maddə.

**HORMONÁL** *sif.* [*yun.*] *fiziol.* Tərkibində hormon olan, hormondan ibarət olan. *Hormonal preparat. Hormonal maddələr.*

**HOROSKOP** *is.* [*yun.*] 1. Taledən xəbər verən ulduzların düzümü; ulduz falı.

2. Münəccimlik.

**HORRA** *is.* 1. Müxtəlif maddələrdən ibarət sıyıq kütlə. [Qurban:] *Qanın qaralmasın, Telli, yerə töküləni yığıb vermişəm, sexdə alma horrası qayırsınlar.* Ə.Məmmədxanlı. – *Təkərlərdən qopan horra palçıq yola səpilmiş narın ağ duzun üstünü tamam örtdü...* İ.Məlikzadə. // Sıyıq, duru halda olan xörək. *Bir aydan artıq Almazın ağzına horra tökdülər.* S.Rəhimov. *Yazıq uşaqcığazlar gündə bircə dəfə arpa unundan horra bişirib içirlər.* M.Hüseyn. // *məc.* Çox sıyıq, duru bişirilmiş xörək haqqında. *Bu umac deyil, horradır. Xəmiraşı çox horradır.*

2. Heyvanlar üçün xüsusi sıyıq yem. *İt üçün horra hazırlamaq. İnək horranı yedi.*

**HORTLATMA** "Hortlatmaq"dan *f .is.*

**HORTLATMAQ** b a x **hortuldatmaq**. [Axund] *bir də gözünün altından Qumruya baxdı, çayını hortlatdı.* Mir Cəlal.

**HORTULDATMA** "Hortuldatmaq"dan *f.is.*

**HORTULDATMAQ** *f.* Hortultu ilə içmək; hortlatmaq. *Ayranı hortuldatmaq. İnək horranı hortuldatdı.* – *Yarməmməd pərt olub tələsik çayını hortuldatdı..* M.İbrahimov.

**HOR(T)ULTU** *is.* Mayeni udarkən qırtlaqdan çıxan səs. *Oğlan horultu ilə su içən kəlləri çubuqlayıb arabanı suya saldı.* İ.Şıxlı. *İçəridə ancaq stəkanların çaqqıltısı, bir də Qarakişinin hortultusu eşidilirdi.* B.Bayramov.

**HOSPİTAL** *is.* [*alm.*] Hərbi xəstəxana. *Səlim səhiyyə məntəqəsində başdan-ayağa sarınandan sonra səhra hospitalına, buradan da arxa hospitala köçürüldü.* S.Rəhimov. *..Mədətov, manevrdə qıçı burxulduğu yçyn bir hospitalda on gün yatmışdı.* Ə.Əbülhəsən.

**HOŞ** *təql.* Eşşəyi hərəkətə gətirmək, yerişini sürətləndirmək və ya dayandırmaq üçün çıxarılan səs. *Hətta küçədə də bir tərəkəmə*

*eşşəyinə hoş deyəndə mən dayanıb dururam, .. elə bilirəm ki, mənə deyir.* E.Sultanov.

**HOTÉL** *is.*[ *fr.*] Mehmanxana, qonaq evi.

**HOV**[1] *is. dan.* Kömək. *Çataydı elimdən köməyim, hovum; Kəsərdən qalmayan qılıncım, sovum.* Aşıq Şəmşir. *Yaxınlarla sıx əlaqə yaradılmış, onlardan hov istənilmişdi.* Ə.Vəliyev. □ **Hova çatmaq** *dan.* – köməyinə çatmaq, kömək etmək, kömək əli uzatmaq, əlindən tutmaq. [Ana:] *Xasay, sən ata üzü görməmisən, mən bir üzü gəlin, bir üzü qız səni saxlamışam. İndi böyüyüb hovuma çatırsan?* Ə.Vəliyev.

**HOV**[2] bax **ho, ho-ho**. *Cütçü hər şeydən bezar və cansız bir səslə hov, hov, hov deyə səslənir, səslənirdi.* M.İbrahimov.

**HOV**[3] *is. dan.* Şişmə, iltihab (yara haqqında). □ **Hov eləmək** – şişmək, iltihab etmək. [Kazım Səfərə:] *Ola bilər ki, ətin içində sümük qırığı da qalsın. Onun üçün hov eləyir..* Çəmənzəminli. **Hovu çəkilmək** – şişi çəkilmək, şişi azalmaq.

**HOVXURMA** "Hovxurmaq"dan *f.is.*

**HOVXURMAQ** *f.* Yarımbükülü barmaqlarını ağzına tutaraq nəfəsi ilə onları qızdırmaq. *Hovxurub əllərini qızdırmaq. – Sən şaxtada bir küçəyə çıx! Əllərini hovxuran dayananlara bax!* R.Rza. *Süd qoxulu nəfəsini; Əllərinə hovxuraraq; Gileylənir kiçik uşaq.* Ə.Kürçaylı.

**HOVLAMA** "Hovlamaq"dan *f.is.*

**HOVLAMAQ** *f. dan.* Kömək etmək, əlindən tutmaq. [Fərrux:] *..Hovlayıb saxladığım camaatın hamısı düşmənim olub.* Ə.Vəliyev.

**HOVLANMA** "Hovlanmaq"dan *f.is.*

**HOVLANMAQ** *f. dan.* Şişmək, iltihab etmək (yara). *Ürəkdə yara sızlar; Hovlanıb yara sızlar; Yaralılar dərdini; Nə bilir yarasızlar?* (Bayatı).

**HOVUR** *is. dan.* Az vaxt, an, müddət. □ **Bir hovur** – bir az, azca, azacıq zaman. *Bir hovur gözlə. –* [Şirməmməd:] *Ay ana, nə vaxtadək sən məni bəbə hesab edəcəksən? Bir hovur evə gec gəlib çıxanda nigaran olacaqsan?* E.Sultanov. *..Bir hovur oturub nəfəs dərməyə daş kölgəsi də yox idi.* Mir Cəlal.

**HOVUZ** *is.* [*ər.*] Su yığıb saxlamaq üçün daşdan, kərpicdən və s.-dən düzəldilmiş sututar; çarhovuz. *Üzgüçülük hovuzu. Hovuzdan su buraxmaq. – Bu zaman Qətibə hovuzun kənarında dayanmışdı, suda üzməkdə olan əlvan balıqlara baxırdı.* M.S.Ordubadi. *Su götürdüm hovuzdan; Seçilmərəm tovuzdan; Mənə bir xəbər deyin; Köynəyi qanovuzdan.* (Bayatı).

**HOVUZCUQ** *is.* Kiçik hovuz, balaca çarhovuz. *Hovuzcuqda əl-üzünü yumaq. Hovuzcuqda qızılbalıqlar üzür. – Səkilərin küncündə daşdan hovuzcuqlar olardı. Onlara uşaq oynamaq üçün ılıq su tökərdilər.* H.Sarabski.

**HOVUZLU** *sif.* Hovuzu olan. *Hovuzlu həyət. Hovuzlu bağça.*

**HOYDU** bax **haydı**. *Hoydu, irəli! –* [Koroğlu:] *Hoydu, dəlilərim, hoydu; Yeriyin meydan üstünə.* "Koroğlu".

**HOYDU-HOYDU: hoydu-hoyduya götürmək** *dan.* – gülərək, fitə basaraq, cürbəcür səslər çıxararaq ələ salmaq, masqaraya qoymaq, gülmək, dolamaq, hoydulamaq. [Əliqulu:] *Canım, siz məni hoydu-hoyduya götürmüsünüz nədir?* S.Rəhman. [İlyas Adiləyə:] *Elə bilirdim ki, kənd uşaqları atı minməyib yedəyimdə apardığım üçün məni ələ salıb, hoydu-hoyduya götürəcəklər.* Ə.Məmmədxanlı.

**HOYDULAMA** "Hoydulamaq"dan *f.is.*

**HOYDULAMAQ** bax **hoydu-hoyduya götürmək** ("**hoydu-hoydu**"da).

**HOZƏKİ** *sif. dan.* Səliqə ilə iş görə bilməyən, iş görərkən şeyləri sındıran, dağıdan, əlindən salan, yöndəmsiz iş görən. *Hozəki adam. Hozəki qız.*

**HÖCCƏLƏMƏ** "Höccələmək"dən *f.is.*

**HÖCCƏLƏMƏK** bax **hecalamaq**. *Kazım gecələr hisli neft lampasının işığında hıçqıra-hıçqıra sözləri höccələyib oxumaqdan doymazdı.* M.İbrahimov. *Şahnigar xanım .. gecələr çətinliklə də olsa mollaxanada oxuduğu hərfləri yadına salıb höccələyə-höccələyə şeirləri əzbərlədi.* İ.Şıxlı.

**HÖCƏT** [*ər.*] 1. *is.* Öz dediyindən, əməlindən, xasiyyətindən əl çəkməmə; inad, inadkarlıq, tərslik. [Rüstəm kişi:] *Nə höcətsən, ay arvad! Deyirlər, yemlə, yemlə, vəssəlam!* M.İbrahimov. [Hatəmxan ağa:] *Sən onu tanımırsan, məgər ki, necə höcətdir.* M.F.Axundzadə. □ **Höcət etmək** – öz tərsliyindən, inadından əl çəkməyərək mü-

bahisə etmək; höcətləşmək. *Bu yeddi nəfər isə hələ höcət edirdi.* Ə.Əbülhəsən. // Mübahisə, çəkişmə, dava. *Əgər iki tazı bir dovşan tutsaydı, tazı sahibləri arasında höcət və dava başlanardı.* H.Sarabski. *Maralın .. höcəti də həmin bu kötüyün üstündə olmuşdu.* Ə.Əbülhəsən.

2. *sif.* İnadkar, inad, inadcıl, tərs, höcətçi. [Leyla xanım:] *Mən qorxuram, Rəhim kişi məni xataya sala, höcət adamdır.* N.Vəzirov. [Sərvinaz Nəcəfalıya:] *Elə bil bu ata uşağının hamısı anadan höcət* (z.), *hirsli gəlib.* B.Bayramov.

◊ **Höcəti kəsmək** – aradakı mübahisəni, davanı həll etmək. *Hatəmbaba* [Sənəm və Qənbərin] *höcətini kəsdi.* Ə.Əbülhəsən.

**HÖCƏTÇİ** *sif.* Yersiz höcət etməyi, mübahisə etməyi sevən adam; höcətkar, inadcıl, inadkar, tərs. *Höcətçi adamdır.* // İs. mənasında. *Höcətçinin biridir, danışmağa dəyməz.*

**HÖCƏTÇİLİK** *is.* Höcətçi adamın xasiyyəti; höcətkarlıq, inadcıllıq, inadkarlıq, tərslik. *Höcətçiliyindən əl çəkməmək.*

**HÖCƏTKAR** *sif.* [*ər.* hüccət və *fars.* ...kar] b a x **höcətçi**. *Höcətkar adam.*

**HÖCƏTKARLIQ** b a x **höcətlik**.

**HÖCƏTLƏŞMƏ** “Höcətləşmək”dən *f.is.*

**HÖCƏTLƏŞMƏK** *qarş.* İnadlarından əl çəkməyərək bir-biri ilə mübahisə etmək, höcət etmək, bəhsləşmək, bir-birinə güzəştə getməmək. *Uşaqlar bir-biri ilə höcətləşirdilər.* – [Tapdıq və Mayis] *bir müddət höcətləşdilər.* Ə.Vəliyev. *Sona üstündə* [Bülənd və Veys] *höcətləşmişdilər.* Ə.Əbülhəsən.

**HÖCƏTLİK** *is.* Höcət adamın xasiyyəti; inadkarlıq, inadcıllıq, tərslik. [Mahmud:] *Görünür, sən ərindən əl çəkərsən, höcətliyindən əl çəkməzsən.* Ə.Haqverdiyev. [Hidayət Sənubərə:] *Axı bu höcətlik, inamsızlıq, etiqadsızlıq səndə haradan əmələ gəlib?* B.Bayramov.

**HÖKM** *is.* [*ər.*] 1. Əmr, buyruq, sərəncam. [Mirzə Məmmədqulu:] *Camaat, bu gün cənab naçalnikin hökmü mövcibincə burada bir siyahı qərar verilib.* C.Məmmədquluzadə. [İskəndər:] *Hökmümə baş əydi Hind, Həbəş, İran.* A.Şaiq. ☐ **Hökm çıxmaq** – əmr gəlmək, göstəriş verilmək. *..Möminlər və dindarlar mərkəzindən hökm çıxmışdı ki, gərək qurban bayramının günü bir nəfər oxumuş məscidə gəlməmiş olmasın..* C.Məmmədquluzadə. **Hökm etmək (eləmək)** – 1) əmr etmək, buyurmaq, sərəncam vermək. *Padşah hökm elədi, həkimi Diləfruz xanımın yanına apardılar.* “Məsum”. *Mən aşıq dara çəkər; Zülfünü dara çəkər; Şahın qəzəbi tutsa; Hökm elər, dara çəkər.* (Bayatı); 2) *məc.* ağalıq etmək, hökmranlıq etmək, hökm sürmək. [Nüşabə:] *Fələklər dönsə də, ürəyim dönməz; Zülmət hökm etsə də, al günəş sönməz.* A.Şaiq. *Təyyarə meydanı, qazma daxmalar; Ətrafda hökm edir çovğun, şaxta, qar.* M.Rahim. **Hökm sürmək** – b a x **hökm etmək** 2-ci mənada. *İndi hökm sürür acı hıçqırıq; Ağlayıb, ağlayıb, susdular artıq.* M.Rahim. *Ağır bir sükutun qəsəbədə hökm sürdüyünü görən Leylək çiynindəki beşaçılan tüfəngini hərləyib əlinə aldı.* S.Rəhimov.

2. İşə baxdıqdan sonra məhkəmənin çıxardığı qərar. *Məhkəmənin hökmü. Hakim hökmü elan etdi.* – *Qanun üzrə mühakimə olundu; Fərman çıxdı, asılsın, hökm oxundu.* A.Səhhət. ☐ **Hökm vermək** – işə baxdıqdan sonra məhkəmədə qərar çıxarmaq. // *məc.* Güc, qüvvə, təsir. *Yayın hökmü keçdi.* – *Qışın hökmü rəvandır; Hər tərəf ağ boyanmış.* R.Rza.

◊ **Hökmdən düşmək** *hüq.* – öz qüvvəsini itirmək, əhəmiyyətini itirmək, nüfuzunu itirmək. *Köhnə qərar hökmdən düşdü.* **Hökmü keçmək** – 1) hökmü, qüvvəsi, nüfuzu, təsiri olmaq, əmri, göstərişi yerinə yetirilmək; 2) b a x **hökmdən düşmək**.

**HÖKMDAR** *is.* [*ər.* hökm və *fars.* ...dar] Padşah, şah, hakim. *Ağvan hökmdarı.* – [Şeyda:] *Fəqət atəşli bir qəlblə inqilaba başladı,* [elə] *xunxar, məğrur bir hökmdarın taxtını başına çevirdi.* H.Cavid. *Ümumiyyətlə Şərq hökmdarlarının ətrafındakı işçilərin dəyərsizliyi hökmdarın özünün dəyərsizliyindən doğur.* M.S.Ordubadi.

**HÖKMDARLIQ** *is.* Padşahlıq, şahlıq, hakimiyyət, səltənət. *Səfəvilərin hökmdarlıq dövrü.* ☐ **Hökmdarlıq etmək** – padşahlıq etmək, şahlıq etmək, hökm sürmək, ağalıq etmək. [Qızıl Arslan:] *Biz Azərbaycanda*

*hökmdarlıq edirik.* M.S.Ordubadi. // Hökmdarın idarəsi altında olan ölkə.

**HÖKMƏN** *zərf* [*ər.*] Mütləq, necə olursa olsun, hələm-həlbət. *Axşam hökmən bizə gəl. – Amma Teymur istəyirdi ki, Güldəstə hökmən o gecəni xatırlasın.* H.Seyidbəyli. *İnanıram mən; Həmin o həqiqət gələcəkdir; Başqa birisinin dililə hökmən; Deyiləcəkdir.* B.Vahabzadə.

**HÖKMFƏRMA** *is.* [*ər.* hökm və *fars.* ...fərma] Hökm sürmə, hökmran olma. *Lakin ..* [Muxtar] *sabaha qədər yata bilmədi, tərəddüd yenə hökmfərma idi.* Çəmənzəminli. *Hər tərəfdə bir qəbiristan sükutu hökmfərma idi.* M.S.Ordubadi. ◻ **Hökmfərma olmaq** – 1) hökm sürmək, hökmran olmaq. [Cavad bəy:] *..Şərqdə hər zülm fot olacaq, ədalət, insaniyyət hökmfərma olacaq...* N.Vəzirov; 2) *məc.* çox yayılmaq, şiddət göstərmək. [Xarrat:] *Nə edəsən ki, məhəlləmizdə hökmfərma olan bir gözağrısı hasil oldu, buna sirayət etdi.* T.Ş.Simurq. *..Kərimovun səsi ətrafda hökmfərma olan gözəl ahəngi pozdu..* H.Seyidbəyli.

**HÖKMLÜ** *sif.* 1. Amiranə, əmredərcəsinə, əmredici, ötkəm. *Rüstəm kişi hökmlü səslə* [Lal Hüseynə] *qışqırdı: – Qan sizi tutub! Əlli toğlu Sarıqamışlıqda nə gəzirdi?* M.İbrahimov. [Qız] *"xoşgəldin" əvəzinə deyilən bu hökmlü sözlərin mənasını dərk etdikdə isə birdən yenə gülümsündü.* İ.Hüseynov. *Bəlkə qələmimi eşitmir masam; Şahların əsası ondan hökmlü!* M.Araz.

2. Hökmü, nüfuzu, təsiri olan. *Çox hökmlü adamdır. – Uzun illər əsrlər boyu insan xəyalını; insan arzusunu, sözünü, insanın özünü; sıxıb qanun adlı qəlib .. ya hökmlü, ya hökmsüz.* R.Rza.

**HÖKMRAN** [*ər.* hökm və *fars.* ...ran] 1. *is.* Hökmdar, diktator. [Ruhani:] *Rəiyyəti hökmranlar itaətində saxlayan, onlara tabe etdirənlər biz ruhanilərik..* S.S.Axundov. [Fitnə:] *Taxta sahib olan zaman; Çox gənc idi bu hökmran..* A.Şaiq.

2. Bax **hökmfərma**. *Boran hər yerə hökmran idi. – Qış bütün şəhərə hökmran olaraq hər tərəfi qalın ağ bir örtüyə sarımışdı.* A.Şaiq.

3. Bax **hökmlü** 1-ci mənada. *Hökmran səs.* – [Bəhlul:] *Nənəm hökmran əda ilə telefon danışığını kəsdi.* B.Bayramov.

**HÖKMRANLIQ** *is.* 1. Hakimiyyət, diktatura. *Siyasi hökmranlıq.* ◻ **Hökmranlıq etmək** – hakimiyyət sürmək, hakimiyyət başında durmaq. [Hüsnübəyimin:] *Belə də iş olar? Çoban qızı gəlib bizim üstümüzə hökmranlıq eləsin?* İ.Məlikzadə. // *məc.* Ağalıq etmək, hökm sürmək. [Ağabəy] *qardaşı Baxış bəy kimi hökmranlıq eləmək arzusunda da deyildi.* Ə.Abasov.

2. *məc.* Hökm sürmə, hökmfərma olma. *Küləyin hökmranlığı.*

**HÖKUMƏT** *is.* [*ər.*] Dövlət hakimiyyətinin, dövləti bilavasitə idarə edən icraedici və sərəncamverici orqanı. *Hökumət binası. Hökumətin xarici siyasətində sülh uğrunda mübarizə əsas yer tutur. – Bir ölkənin milyon-milyon vətəndaşı; Başqa-başqa düşünərsə; Bəs hökumət nəyə gərək?* B.Vahabzadə. // Həmin orqanın üzvləri. *Hökumət istefaya çıxdı. – Yaxşı ki, hökumət, yaxşı ki, dövlət; Yenə sahib durur atılmışlara!* B.Vahabzadə.

**HÖKUMƏTSİZLİK** *is.* Bir ölkədə hökumətin olmadığı vəziyyət; hakimiyyətsizlik, anarxiya, hərc-mərclik.

**HÖNKÜRMƏ** "Hönkürmək"dən *f.is.*

**HÖNKÜRMƏK** *f.* Hönkürtü ilə, səslə, hönkürə-hönkürə, hıçqıra-hıçqıra ağlamaq. *Onlar – hər iki qardaş dizlərini yerə çırpıb, bu mənzərənin qarşısında səs dolusu hönkürdülər.* S.Rəhimov. *Rəhilə isə artıq hönkürməyə başlamışdı.* M.Hüseyn.

**HÖNKÜRƏ-HÖNKÜRƏ** *zərf* Səslə, hönkürtü ilə, hıçqıra-hıçqıra. *..Sıxıntı və ciddiyyətdən* [Anaxanım] *uşaq kimi hönkürə-hönkürə ağlamağa başladı.* A.Şaiq.

**HÖNKÜRTÜ** *is.* Hönkürüb ağlayarkən çıxarılan səs. *Lələ ilə dayənin hönkürtü ilə ağlamalarını görən Kiçikbəyim də özünü saxlaya bilmədi.* Çəmənzəminli. *Qapıdan yenicə içəriyə girən Kərimqulunun kal səsi də Əmiraslan babanın hönkürtüsünə qarışdı.* S.Rəhimov. ◻ **Hönkürtü vurmaq (qoparmaq)** – hönkürtü ilə, səslə, hıçqıra-hıçqıra ağlamaq. *Uşaq əlini Qaragözün əlindən çəkib, daha ucadan hönkürtü qopararaq*

*ayaqları dolaşa-dolaşa alaçığa getdi.* M.İbrahimov.

**HÖNKÜRÜŞMƏ** "Hönkürüşmək"dən *f.is.*

**HÖNKÜRÜŞMƏK** *qarş.* Hönkürtü ilə ağlaşmaq, səs-səsə verib ağlamaq. [Salatınla Mələk] *ağır fəlakətə düşmüş və dar gündə rastlaşıb, bir-birinə həyan olan doğma adamlar kimi qucaqlaşıb hönkürüşdülər.* İ.Şıxlı.

**HÖRDÜRMƏ** "Hördürmək"dən *f.is.*

**HÖRDÜRMƏK** *icb.* Başqasına hörmə işi gördürmək. [Nəbi:] *Gümüşdən döydürrəm sənin nalını; Yüz gözələ hördürərəm yalını; Boz at, qurtar məni, aman günüdür!* "Qaçaq Nəbi".

**HÖRGÜ** *is.* 1. Hörmə işi, hörmə tərzi; tikmə. *Daşları müəyyən qaydalara əməl edərək bir-birinə yapışdırmaq prosesinə hörgü deyilir.* // Hörülmüş divar və s. *Əhməd .. gözünü saralmış daşlara, uçuq-sökük yerlərə, hörgülərin arasında bitən quru otlara zillədi.* İ.Şıxlı. // Çəpər, maneə. *Məftil hörgü. Hörgü xətti.*

2. İpdən, qamışdan, güldən və s.-dən hörülmüş şey.

3. B a x **hörük**.

**HÖRMƏ** 1. "Hörmək"dən *f.is.*

2. *sif.* Hörməklə düzəldilmiş; hörülmüş, hörülmə. *Hörmə stul. Hörmə çəpər. – Şirmayı hörmə kreslonu çəkib, atasının yanında oturdu.* M.Hüseyn.

3. B a x **hörük** 3-cü mənada. *Dal gərdənə tökülübdür hörmələr; Mina kəmər incə beli bürmələr.* Aşıq Abbas.

**HÖRMƏK** *f.* 1. Kərpici, daşı müəyyən qaydada palçıqla bir-birinə yapışdırmaq. *İkinci mərtəbəni hörüb qurtarmaq. –* [Qaçay:] [Mahmud] *dəli deyil ki, belə soyuq bir gündə daş daşısın, əhəng, palçıq gətirsin, yaxud hündür bir divarın üstünə çıxıb divar hörsün.* Ə. Xəlil. *Dodaqaltı segah deyən qoca bənnalar; Sal daşlardan təməl qoyur, divar hörürdü.* Ə.Cəmil. // Bir şeyi divar arasına qoyub gizlətmək, orada yerləşdirmək. *Tüfəngi divarda hörmək.* [Pərviz xan:] *Baş hərəm olmaq üçün mənə öz arvadımı öldürtdün. Öz əlimlə qızımı divar arasına qoyub hördürdüm.* Ə.Haqverdiyev.

2. İp, məftil, qarğı və s.-ni bir-birinin içərisindən keçirərək bir şey düzəltmək; toxumaq. *Həsir hörmək. – Piri kişi qapısında oturub səbət hörürdü.* S.S.Axundov. *Göllər kənarından keçdim yaz günü; Əlvan çiçəklərdən çələnglər hördüm.* N.Xəzri.

3. Hörük toxumaq, hörük etmək, hörükləmək. *Atın yalını hörmək. – Zeynəb saçlarını səliqə ilə hörüb, boynunun dalına yığmışdı.* M.İbrahimov. *Qız durdu səhər-səhər; Saçını hördü, gəldi.* R.Rza.

**HÖRMƏT** *is.* [*ər.*] 1. Böyüklərə, yaşlılara və ya ləyaqətinə, xidmətinə görə birinə göstərilən ehtiram; sayğı. *Böyüyə hörmət. Ata-ana hörməti. – Bizdə şeir də var, sənət də vardır! Şairə, sənətə hörmət də vardır...* S.Vurğun. *Ataya hörmət etməyən çocuğun; Anaya xidmət etməyən çocuğun; Nə olur kəndi nəfsinə xeyri; Nə də ondan vəfa görər qeyri!* M.Ə.Sabir. ☐ **Hörmət bəsləmək** – ehtiram göstərmək, hörmətini saxlamaq, hörmətli münasibət göstərmək. ..[Student] *təzə ailənin gənc üzvlərinə qarşı qəlbində bir hörmət bəsləməyə başladı.* Çəmənzəminli. **Hörmət etmək (göstərmək, qoymaq)** – 1) ehtiram etmək (göstərmək), saymaq, sayğı göstərmək, hörmətini saxlamaq. *Arvad almanı dərvişin əlindən alıb, ona çox hörmət göstərib, sonra əlini döşünə qoyub, ondan razılıq elədi.* (Nağıl). *Qonuma-qonşuya göndərib xəbər; Bağban hörmət etdi əziz mehmana.* M.Rahim. [Qətibə xatunun Toğrula yazdığı məktubunda:] *Xəlifə həzrətləri mənə bir hökmdara layiq hörmət göstərdi..* M.S.Ordubadi; 2) *məc. dan.* Yaxşılığının əvəzini çıxmaq. *Əgər xəbər düz çıxdı,* [Koroğlu] *o adama xələt verib, hörmət elərdi.* "Koroğlu". **Hörmət qazanmaq** – ehtiram edilmək, sayılmaq, hörməti, etibarı, nüfuzu artmaq, hörmətə çatmaq. *İnsanlar biliklə hörmət qazanar; Bunu heç bir zaman unutma, zinhar!* Şəhriyar. **Hörmətdən düşmək** – hörmətini, nüfuzunu, etibarını itirmək. **Hörmətdən salmaq** – hörmətdən düşməsinə səbəb olmaq, nüfuzdan, etibardan salmaq, gözdən salmaq. [Şamxal düşünürdü:] *Bu nə idi? Kişiyə sataşan kim idi? Yoxsa onu tək görüb üstünə ayaq alırdılar? Camaat arasında hörmətdən salmaq istəyirdilər?* İ.Şıxlı. **Hörmətə çatmaq** – b a x **hörmət qazanmaq**. *İstərdim o da mən*

*kimi bir hörmətə çatsın; Azadə dolansın.* M.Ə.Sabir. **Hörmətə minmək** – hörməti artmaq, hörmət qazanmaq, hörmətli olmaq. *Yenə də Kərbəlayı Hətəm xanla Hacı Səfiqulu bərk hörmətə minir.* S.Rəhimov. **Hörmətini gözləmək (saxlamaq, tutmaq)** – bax **hörmət etmək**. *Bir-iki gün ki sənə, ey nigar, mehmanəm; Nolur əgər tutasan hörmətin bu mehmanın?* S.Ə.Şirvani. *Dəftərxanada Mirzənin hörmətini gözlərdilər. Çünki sair mirzələr bir abbası, altı şahı hər işə gələndən rüşvət alardı, amma Mirzə öz maaşına kifayət edib bir qəpik də olsun rüşvət almazdı.* Ə.Haqverdiyev. *Lakin o olmuşdur ilk köməyimiz; Ellər hörmətini saxlamış onun.* N.Xəzri. **Hörmətini yerə vurmaq** – 1) bax **hörmətdən salmaq**; 2) edilən yaxşılığı yerə vurmaq, nankorluq etmək.

2. Şərəf, şan, heysiyyət. *Abır, həya, hörmət bilməyən gözəl; Çəksə də üzünə pərdə, yaraşmaz!* Aşıq Şəmşir. *Çıxdın ağ günlərə, arzuna çatdın; Bu hörməti sənə bu dövran verdi.* Aşıq Hüseyn.

3. *məc.* Güzəşt, mərhəmət, iltifat, xətir. *Ona hörmət etdikcə başa çıxır.*

4. **Hörmətlə** şəklində *zərf* – hörmət edərək, ehtiramla, sayğı ilə. *Onun arxasınca şair də baxdı; Vüqarla, izzətlə, hörmətlə dedi..* M.Rahim. *Sona* [Ümidi] *görəndə hörmətlə salam verir .. yanaqlarına qızartı çökürdü.* B.Bayramov.

**HÖRMƏTCİLLİK** *is.* Hörmətcil adamın xasiyyəti; hörmət etmə, ehtiram bəsləmə; hörmətkarlıq. *Əlyarov qarının bu yaşda belə əlli-ayaqlı tərpənməyini, hörmətcilliyini görəndə istər-istəməz yumşalıb gülümsündü.* M.Hüseyn.

**HÖRMƏTÇİ, HÖRMƏTCİL** *sif.* Adamlara hörmət edən, onlara sayğı göstərən, hörmətkar. *Çox hörmətcil adamdır. Hörmətcil gənc. – Hörmətcil çobanlarla vidalaşıb atları sürdü.* R.Rza.

**HÖRMƏTƏN** *zərf* [*ər.*] *klas.* Hörmət əlaməti olaraq, hörmət edərək, hörmətlə, sayğı ilə, ehtiramla. *Ayinə hörmətən hər kəs susub, qızların oxumasına müntəzir idi.* Çəmənzəminli. *Yolçular da insafən* [intelligentin] *bu alimanə çıxışına hörmətən heç bir səs çıxarmadılar.* Qantəmir.

**HÖRMƏTKAR** *sif.* və *zərf* [*ər.* hörmət və *fars.* ...kar] 1. Hörmət ifadə edən; hörmətli, ehtiramlı. *Hörmətkar münasibət.* – [Çopo:] *Gənclər hörmətkar bir nəzakətlə birinci pilləyə yanaşdılar.* Çəmənzəminli. *..Qız bu dəfə mülayim və hörmətkar bir ifadə ilə cavab verdi..* İ.Əfəndiyev.

2. Hörmətcil, hörmət edən.

**HÖRMƏTKARLIQ** bax **hörmətcillik**.

**HÖRMƏTLİ** *sif.* Hörməti olan, hörmətə layiq olan; möhtərəm, sayğılı. *Hörmətli şəxs. Hörmətli müəllimimiz. – Hər igid hörmətlidir; Mərd insanlar içində; İlk sırada dayanan qəhrəmanlar içində.* R.Rza. // Hörmətlə müraciət zamanı işlənir. *Hörmətli vətəndaş. Hörmətli yoldaşlar. Hörmətli dost.*

**HÖRMƏTSİZ** *sif.* 1. Nəzakətsiz, ədəbsiz, qaba, tərbiyəsiz, saymaz. *Hörmətsiz münasibət.* – [Qadın:] *Mən ona hörmətsiz bir söz deməkdən özümü saxlamaq üçün dönüb otaqdan çıxdım.* M.Hüseyn.

2. Hörməti, etibarı olmayan, etibardan düşmüş, sayılmayan, bihörmət. *Hörmətsiz adam. Pis əməllərin nəticəsində hörmətsiz oldu.*

**HÖRMƏTSİZLİK** *is.* Nəzakətsizlik, ədəbsizlik, ehtiramsızlıq, sayğısızlıq, qabalıq, tərbiyəsizlik. *Bizim kimi uşaq-muşaqlar xanım deməyə qorxardı, eyib idi, hörmətsizlik sayılırdı.* Qantəmir.

**HÖRÜK** *is.* 1. Hörülmüş qadın saçı; saç burumu; hörmə. *Qızın xurmayı hörüyü.* – [Yasəmən] *.. başını yumaq fikri ilə qara, uzun saçlarını hörükdən açıb döşünə tökdü.* S.S.Axundov. *Tükəzban xalanın .. əyildikcə yoğun hörükləri çiynindən sürüşüb sinəsinə düşürdü.* İ.Şıxlı. ◻ **Hörük etmək** – hörmək, hörük şəklinə salmaq. *Gülşad göyzəmin krep-satindən yaxası düyməli, qollu, uzun don geymiş, hamar daradığı gur, sarışın saçını iki hörük edib kürəyinə atmışdı.* Ə.Əbülhəsən. // *sif.* Hörülmüş, hörük şəklində olan. *Topuqlarına qədər uzanan iri hörük saçından başqa onun heç bir köhnə Zeynəbliyi qalmayıbdır.* Qantəmir.

2. Otlamaq üçün buraxılan heyvanın uzağa qaçmamaq üçün ayağından bağlanan uzun ip. *İnəyin hörüyü. Qoyunun hörüyünü dəyişmək. – Birdən baxdı ki, alaçıqlardan o tərəfdə çoxlu at var,* [amma] *hamısı hö-*

*rükdədi.* "Aşıq Ələsgər". *Dumanlar dağılır ətrafa qat-qat; Arabir kişnəyir hörükdəki at.* S.Vurğun.

3. Bir-birinə sarınmış, hörülmüş hər cür şey. *Gül hörüyü. – Ovçu .. müxtəlif bitkilərin uzun hörüklərindən yapışıb, özünü yuxarı qaldırır, girinti-çıxıntıları ayaqları altında pillə edərək, sanki dik bir divara dırmaşırdı.* Ə.Məmmədxanlı.

**HÖRÜKLƏMƏ** "Hörükləmək"dən *f.is.*

**HÖRÜKLƏMƏK** *f.* 1. Saçı hörük şəklində hörmək. *Qız saçını hörüklədi.*

2. Otlamaq üçün buraxılmış ev heyvanını hörüyə (2-ci mənada) bağlamaq. *Qoyunu hörükləmək. – Mədəd atını yedəkləyib, otluqda hörüklədi.* M.Hüseyn. *Əlləzoğlu atı heç də bu səmtdə hörükləmədiyini, səhv gəldiyini başa düşsə də, dayanmadı.* İ.Hüseynov.

**HÖRÜKLƏNMİŞ** *f.sif.* Ayağına hörük bağlanmış; hörüklü. *Hörüklənmiş inək. –* [Hümmət] *dinməz-söyləməz dönüb kənarda hörüklənmiş ata doğru addımladı.* B.Bayramov.

**HÖRÜKLÜ** *sif.* 1. Hörüyü olan, saçı hörülmüş. *O qoşa hörüklü gümrah qızcığaz; Sənin kiçik dostun hanı, Bənövşə?* M.Dilbazi.

2. Otlamaq üçün hörüyə bağlanmış, hörükdə olan. *Hörüklü at* (*inək*).

**HÖRÜLMƏ** 1. "Hörülmək"dən *f.is. Ağac budaqlarından hörülmə çəpər.*

2. B a x **hörmə** 2-ci mənada. *Bəy oturacağı hörülmə qara kürsüdə əyləşib kitab oxuyurdu.* Ə.Vəliyev.

**HÖRÜLMƏK** *məch.* 1. Tikilmək, inşa edilmək (daşdan, kərpicdən). *Binanın birinci mərtəbəsi hörülüb qurtardı. – Bənnasız hörgü hörülməz; Təbibsiz xəstə dirilməz.* "Koroğlu".

2. Hörmə üsulu ilə hazırlanmaq, toxunmaq. *Qarğıdan səbət hörüldü.*

**HÖRÜLMÜŞ** *f.sif.* 1. Tikilmiş, inşa edilmiş. *Hörülmüş divar.*

2. B a x **hörmə** 2-ci mənada. *Bir ara, qırmızı sapdan hörülmüş torun dalında elə bil* [Fatmanın] *gözləri qapandı.* Ə.Əbülhəsən. [Dürrə] *boynuna qamışdan hörülmüş bir zənbil asdı..* S.Vəliyev.

3. Hörük edilmiş, hörüklənmiş. *Hörülmüş saç. – Nərminə* [Səltənətin] *səliqə ilə daranıb hörülmüş zil qara, yoğun, gödək hörüklərinə nəzər salıb gülümsündü.* B.Bayramov.

**HÖRÜMÇƏK** *is. zool.* Özünə yem olan həşəratı tutmaq üçün tor toxuyan buğumayaqlı böcək. *Hamının tanıdığı xallı hörümçəyin bədəni çay xərçəngi bədəni kimi baş-döş və qarın hissələrinə ayrılır.. Hörümçəyin baş-döşü üzərində dörd cüt yeridici ayaq vardır.* "Zoologiya". ☐ **Hörümçək toru** – hörümçəyin ifraz etdiyi yapışqanlı şirədən əmələ gələn saplaqdan toxuduğu tor. *Gözümdə hörümçək toru qurdular; O göz yaşlarına inandıqlarım.* M.Araz.

**HÖVKƏLƏMƏ** "Hövkələmək"dən *f.is.*

**HÖVKƏLƏMƏK** *f.* 1. Bədənin hər hansı bir yerini barmaqları ilə sıxmaq, əzişdirmək, ovmaq, ovuşdurmaq; masaj eləmək. *Baldırını hövkələmək. – Eyvaz özünəməxsus təmkinlə danışır, arabir sağ əli ilə təzə qırxılmış çənəsini hövkələyirdi.* Ə.Vəliyev.

2. Bir şeyi əlinin içində sıxıb əzişdirmək, əzmək, büzüşdürmək. *Maxorkanı hövkələmək. – Qız əlində hövkələdiyi kağızı üzünə sıxıb .. ağlayırdı.* B.Bayramov.

**HÖVL** *is.* [*ər.*] Qorxu, dəhşət, vahimə. [Şahmar] *hövl içində həyət qapısına doğru addımladı.* B.Bayramov. ☐ **Hövl eləmək (etmək)** – qorxmaq, dəhşətə gəlmək, dəhşətlənmək, vahimə basmaq. *Təklikdən hövl etmək. – Xəyalı dərinlərə işləyən qoca birdən hövl edib tərpəndi.* B.Bayramov. **Hövl götürmək** *dan.* – b a x **hövl eləmək (etmək)**. *Sübhanverdizadə əlilə Kosanın sözünü kəsdi, onu hövl götürdü, .. başı gicəlləndi, otaq başına firlandı.* S.Rəhimov. *Qar basmış və artıq gecə qaranlığı çökmüş düzənlikdə Cumanı bu səsdən hövl götürdü.* Ə.Əbülhəsən.

**HÖVLƏKİ** *zərf* b a x **hövlnak**.

**HÖVLNAK** *zərf* [*ər.* hövl və *fars.* ...nak] Hövl içində, vəhməli, qorxu içərisində, dəhşətlə. *Mehriban hövlnak yerindən sıçrayıb, ətrafına göz gəzdirdi.* H.Seyidbəyli. *Bir alim dilindən qopdu qığılcım; Oyandı hövlnak daş qərinələr.* M.Araz.

**HÖVSƏLƏ** *is.* [*ər.* hövsələ – çinədan] Səbir, dözüm, dözmə. *Hövsələsi çatmır. – Elə dərd var ki, dəxi onun qabağında səbir, hövsələ mümkün deyil..* C.Məmmədquluzadə.

[Əlimuxtar:] *Eh, çox mənim hövsələm var!* C.Cabbarlı.

◊ **Hövsələdən çıxmaq** – bax **hövsələsi daralmaq**. *..Qaş qaralanda adamlar artıq hövsələdən çıxdılar.* S.Rəhman. [İlyas:] *Axırda dayım, Tərlanın hövsələdən çıxdığını görüb, mənə tərəf döndü.* Ə.Məmmədxanlı. **Hövsələsi çatmamaq** – bax **hövsələsi daralmaq**. [Maral:] *Mənim hövsələm çatmaz, sən oxu, qulaq asım.* S.Rəhman. **Hövsələsi daralmaq (darıxmaq)** – səbir edə bilməmək, dözə bilməmək, özünü saxlaya bilməmək. [Sona xanım:] *Hövsələm daralıb, ağzıma gələni söyləyirəm.* M.F.Axundzadə. [Qız] *danışmaq istəyirdi, hövsələsi darıxırdı..* M.S.Ordubadi. **Hövsələsi gəlməmək** – səbri çatmamaq, səbir edə bilməmək, dözə bilməmək. *Hərçənd orucağız adamın çox danışmağa hövsələsi gəlmir, amma, bu da var ki, bir az yazı-pozuya məşğul olsaq, günü yubadarıq, bir də görərik ki, gün batıb.* C.Məmmədquluzadə. **Hövsələsi tükənmək** – səbri tükənmək, daha dözməmək. *Qara Kərəmoğlunun adını eşidən kimi Rüstəm kişinin hövsələsi tükəndi.* M.İbrahimov. **Hövsələsini basmaq** – dözmək, özünü saxlamaq, səbir etmək, toxtamaq. *Zamanovun tapşırığı çox çəkdiyindən o, hövsələsini basa bilməyib, özünü kabinetin qapısına verdi.* S.Rəhimov.

**HÖVSƏLƏLİ** *sif.* Hövsələsi olan; səbirli, dözümlü. *Çox hövsələli adamdır.* – [*Dəmir:*] *Şah öz rəiyyətlərinin hövsələli* (z.), *dözümlü olub-olmamasını yoxlamaq fikrinə düşür.* Ə.Vəliyev.

**HÖVSƏLƏLİLİK** *is.* Hövsələli adamın xasiyyəti, hövsələli olma; səbirlilik, dözümlülük, dözüm, toxtaqlıq.

**HÖVSƏLƏMƏ** "Hövsələmək"dən *f.is.*

**HÖVSƏLƏMƏK** bax **hövsəmək**. *Düyünü hövsələmək. Toxumu hövsələmək.*

**HÖVSƏLƏSİZ** *sif.* Hövsələsi olmayan, səbirsiz, dözümsüz, toxtaqsız; bir şeydən tez darıxan. *Hövsələsiz adam tez özündən çıxar.* – *Ceyran oxuduğu zaman əsəbi və hövsələsiz müəllimləri xoşlamazdı.* S.Rəhimov. *Lətiflə yarışan rəqibləri lap yaxında dayanıb, hövsələsiz* (z.) *uzağa, yola baxırdılar.* H.Seyidbəyli.

**HÖVSƏLƏSİZLİK** *is.* Hövsələsiz adamın xasiyyəti; səbirsizlik, dözümsüzlük. *İranlıların gecikməsi onları darıxdırırdı, hamıdan da çox hövsələsizlik göstərən Məmməd bəy idi.* Çəmənzəminli. [Səkinə Rüstəmə:] *Bizim borcumuz səbirli olmaqdır, ay Rüstəm, hövsələsizlik eləyib hər şeyi üzlərinə vursaq,* [Maya ilə Qaraş] *da darılıb ipiörkəni qırarlar.* M.İbrahimov.

**HÖVSƏMƏ** "Hövsəmək"dən *f.is.*

**HÖVSƏMƏK** *f.* Buğdanı, düyünü və s.-ni zibildən ayırmaq üçün tabaq, sini və s. içərisində atıb-tutmaq; hövsələmək. *Buğdanı tabaqda hövsəmək.*

**HÖVSƏR** *is.* 1. Dəni hövsəmək üçün tabaq və s. alət. *Buğdanı hövsərlə hövsələmək.*

2. Hövsələmə nəticəsində buğda, düyü və s.-dən ayrılan zibil. *Hövsəri toyuqlar üçün atmaq.*

**HÖVZƏ¹** *is.* [*ər.*] Böyük süni sututar; dəryaça. [Səfərli Aydına:] *Bu dağlarda isə nəhəng bir su hövzəsi düzələcək.* H.Seyidbəyli.

**HÖVZƏ²** *is.* [*ər.*] 1. *coğr.* Qolları ilə birlikdə çayın əhatə etdiyi sahə; dənizə, gölə yapışıq ərazi. *Arazın hövzəsi.* – *Tərtər çayı hövzəsində bu sıra dağ çox dərin dərələrə parçalanır.* Q.Gül. *Bol nemətli, bərəkətli hövzəsi Nilin; Doyurmadı qarnını yoxsul misirlinin.* O.Sarıvəlli.

2. Mədən süxurları, yatağı olan yer. *Kömür hövzəsi.* – *İkinci həftədir o gəlir bura; Uzaq Almaniyadan – Rur hövzəsindən.* Ə.Kürçaylı.

**HÖYÜŞ** *sif.* Bir qədər yaş, nəm, nəm çəkmiş, nəmli. *Höyüş taxıl.* – *İnsanlar bezikib cana dayandı! Qurunun oduna höyüş* (is.) *də yandı.* S.Vurğun. *Qızışıb höyüş otlar; Alışır çubuq kimi.* M.Rahim.

**HÖYÜŞLƏNMƏ** "Höyüşlənmək"dən *f.is.*

**HÖYÜŞLƏNMƏK** *f.* Nəm çəkmək, nəmlənmək, yaşlanmaq, rütubətlənmək. *Un bayırda qalıb höyüşləndi.*

**HULU** *is. bot.* Üzü xovlu iri şaftalı növü; sarı şaftalı. [Piri baba:] *Qızım, daha bəsdir, düş gedək bir qədər armud, üzüm və hulu yığaq.* S.S.Axundov.

**HUMANİST** [*lat.*] 1. Humanizm (1-ci mənada) nümayəndəsi, humanizm tərəfdarı.

2. İnsanpərvər, insansevər, humanizm (2-ci mənada) məsləkli adam. // Sif. mənasında. *Humanist ideyalar. Humanist mədəniyyət. – C.Məmmədquluzadə böyük humanist yazıçı olduğundan həyatdan yazır.* M.İbrahimov.

**HUMANİSTCƏSİNƏ** *sif.* İnsanpərvərcəsinə, insansevərcəsinə, insancasına, insani. *İnsanlara humanistcəsinə münasibət.*

**HUMANİTÁR** *sif.* [*lat.* himanites – bəşəriyyət]: **humanitar elmlər** – ictimai elmlər, insanı və onun mədəniyyətini öyrənən elmlər (tarix, iqtisadiyyat, filologiya və s.).

**HUMANÍZM** [*lat.* humanus – insan] 1. İntibah dövrünün, insan şəxsiyyətinin azad inkişafı, feodalizm və katolisizm zəncirindən azad olması prinsipini elan etmiş mütərəqqi hərəkatı.

2. İnsan ləyaqətinə hörmət; insanpərvərlik, insansevərlik. *Humanizm idealları vətəndaşı da, sənətkarı da həyata və həqiqətə tərəf çəkir.* M.İbrahimov. *Udur xırda balıqları qoca timsah .. Göz yaşları axır, axır. Deyir: – Sülhü qoruyuram bu sularda; Quyruğuna humanizm nişanını özü taxır, qoca timsah.* R.Rza.

**HUNLAR** *cəm* IV əsrdə Asiyadan Avropaya gələn türkdilli köçəri tayfalar. *Belə yaşamışdır dünən və bu gün; Bizim keçmişimiz – oğuzlar, hunlar.* B.Vahabzadə.

**HURİ** *is.* [*ər.*] Əsil mənası "cənnət qızı" olub, klassik şeirdə təşbeh yolu ilə gözəlin epitetlərindən biri kimi işlənir. [Koroğlu dedi:] *Səndən qeyri huri görsəm sevmərəm; Qaldır rübəndini, görüm gül üzün.* "Koroğlu". *Cənnətin hurisi, ərzin mələki; Yetişməz, yüz çala əl-ayaq sənə.* Q.Zakir. [Şahbaz bəy:] *..Mənim ki, sənin* [Şərəfnisə xanım] *tək gözəl yarım var, behişt huriləri gözümə görünməz.* M.F.Axundzadə. ☐ **Huri kimi** – çox gözəl qadın (qız).

**HUŞ** *is.* [*fars.*] 1. Diqqət, fikir. *..Bir iskamyada oturan oğlanın huşunun yarısı müəllimdə olanda, yarısı da yanındakı qızda olacaq..* C.Məmmədquluzadə. [Dərviş:] *Huşum və bədənim ləmsləşdi, pozğunlaşdı, özümü duymaz oldum..* A.Divanbəyoğlu. ☐ **Huşa getmək** – fikrə getmək, fikrə dalmaq, xəyala dalmaq. *Mən səni düşünərək getdiyim zaman huşa; Bəlkə də sən girirsən əlbəyaxa vuruşa?* Ə.Cəmil. **Huşu dağılmaq** – fikrini cəmləşdirə bilməmək, fikri dağılmaq. **Huşundan çıxmaq** – yadından çıxmaq, unutmaq.

2. Mürgü, yarıyuxulu hal. ☐ **Huş aparmaq, huşa getmək** – mürgüləmək. – [Sayalı və Durna] *xəstəxanadan içəri girən zaman Xasay huşa getmişdi.* Ə.Vəliyev. *Kamal da yerinə uzanmış, amma yatmamışdı. Arabir onu huş aparırdı.* M.Rzaquluzadə.

◊ **Huşa getmək** – b a x **huşunu itirmək**. [Vəzir:] [Oğlanın] .. *xörəyinin içinə bihuşdarı tökün. Huşa gedən kimi götürüb tolazlayın bir dərənin içinə.* (Nağıl). **Huşa gəlmək** – ayılmaq, huşu özünə gəlmək, özünə gəlmək. *Reyhan huşa gəlib, özünü divlərin yanında gördü.* (Nağıl). [Münəvvər:] *Ana, sən insaf elə, qoy mən o qədər bu evdə qalım ki, babam huşa gəlsin.* M.S.Ordubadi. **Huşa gətirmək** – ayıltmaq, özünə gətirmək. *Qaraçılar xeyli çalışdıqdan sonra hər ikisini* [Yasəmən ilə Qaraca qızı] *huşa gətirdilər.* S.S.Axundov. *Adamlar oğlanı örtülü maşınların birinin içinə aparıb, huşa gətirməyə başladılar.* Ə.Sadıq. **Huşdan getmək** – b a x **huşunu itirmək**. *Axırda Dəmirçioğlu huşdan gedib yıxıldı.* "Koroğlu". **Huşu başına gəlmək** – b a x **huşa gəlmək**. *Gülsəhərin huşu yavaş-yavaş başına gəlir, adamları tanımağa başlayırdı.* Ə.Vəliyev. **Huşu baş(ın)dan çıxmaq (uçmaq)** – b a x **huşunu itirmək**. *Şahzadə Mütalibin huşu başından uçdu. Bir vaxt gözün açıb gördü, lələ köçüb, yurdu boş, qızlardan əsər yoxdu..* (Nağıl). [Bəhram] *duruxdu, sanki huşu başından çıxdı.* Ə.Vəliyev. **Huşunu aparmaq** – heyran etmək, məftun etmək, valeh etmək. *Əziziyəm bağ sinə; Səyyad keçər dağ sinə; Baxdım, huşum apardı; Mərmər buxaq, ağ sinə.* (Bayatı). **Huşunu başına yığmaq** – fikrini cəmləşdirmək, düşünmək, fikirləşmək, götür-qoy eləmək. *Mən məəttəl qalmışdım və heç macal eləmədim ki, huşumu başıma yığam..* C.Məmmədquluzadə. **Huşunu itirmək** – bihuş olmaq, özündən getmək, huşdan getmək, bayılmaq, qəşş etmək. [Nəbi:] *Yazığın üz-gözü, hər yeri qandır; Huşunu itirib, halı yamandır.* S.Rüstəm.

**HUŞ-GUŞLA** *zərf* Bütün diqqətini toplayaraq, diqqətlə, diqqət yetirərək, fikrini cəmləşdirərək. *Huş-guşla məruzəçini dinləmək. – Qərəz, gördüm ki, müsəlmanlar yığışıblar bir dükanın qabağına və huş-guşla qulaq asırlar.* C.Məmmədquluzadə. *Qadir əmisini dinləyir, süfrə kənarında oturanların da tamam huş-guşla Həmzəyə qulaq asdıqlarını .. xatırlayırdı.* Ə.Əbülhəsən.

**HUŞLU** *sif.* Huşu, ağlı başında olan; fərasətli, dərrakəli, hafizəli. *Huşlu adam. Çox huşlu uşaqdır.*

**HUŞLU-BAŞLI** *sif.* Hafizəsi, yaddaşı yaxşı olan; hafizəli. *Anlaşılırdı ki, Nisə xala bütün kənd işləri ilə əlaqədar, təsərrüfatçı, huşlu-başlı qadındır.* Qantəmir.

**HUŞSUZ** *sif.* və *zərf* 1. Huşu, yaddaşı olmayan, yadında şey qalmayan; unutqan, hafizəsiz, fikridağınıq. *Huşsuz adam.* – [Xudayar qazıya:] [Zeynəb] *o qədər dəlidi ki, o qədər huşsuzdu ki, qorxuram ki, lap dana, deyə ki, mən oğlumu heç vəkil eləməmişəm.* C.Məmmədquluzadə.

2. Huşunu itirmiş, huşu olmayan; bayılmış, bayğın. *Xəstə huşsuz haldadır. – Kəndlilər .. gördülər ki, Molla Qasım meyiti qucaqlayaraq huşsuz uzanmışdır.* S.S.Axundov.

**HUŞSUZLUQ** *is.* 1. Huşu olmayan, yadında şey qalmayan adamın halı; hər şeyi unutma, yadından çıxartma; unutqanlıq. *Huşsuzluqdan dərs yadında qalmır.*

2. Huşunu itirmə, huşu başından getmə, özündən getmə; bayğınlıq. *Huşsuzluqdan ağrı hiss etməmək.*

**HUŞYAR** *sif.* və *is.* [*fars.*] *klas.* Ağıllı, düşüncəli, şüurlu, dərrakəli. *Huşyar adam. – Mülki-dünya aqibət bərbad olur, ey huşyar!* S.Ə.Şirvani. *Mən özüm darülmüəllimini qurtaran zaman Naxçıvanda həmin bir halda özümdən artıq huşyar dostlarıma rast gəldim və onlar ilə tutuşdum.* C.Məmmədquluzadə. // Ayıq, sayıq, diqqətli. ☐ **Huşyar olmaq** – ayıq olmaq, sayıq olmaq, diqqətli olmaq. *Ol ləhzə ki huşyar olursan; Əlbəttə ki, şərm-sar olursan.* Füzuli. *Oxuculardan təvəqqe edirəm ki, müxbirimiz Mozalanbəyin Ordubad və Əylis barəsində yazdığı sözlərə bir qədər əhəmiyyət versinlər. Bu işləri səhl saymaq olmaz, huşyar olmaq lazımdır.* C.Məmmədquluzadə.

**HUŞYARLIQ** *is.* Ağıllılıq, dərrakəlilik, şüurluluq, düşüncəlilik. // Ayıqlıq, sayıqlıq, diqqətlilik.

**HUYLAMA** "Huylamaq"dan *f.is.*

**HUYLAMAQ** *f.* "Huy" deyə çağırmaq; səsləmək, haylamaq. *..Pası özünü təkrar tənbəki və boranı çəpərinin içinə salıb, toyuqları kişləməyə və huylamağa başladı.* S.Rəhimov.

**HÜBAB** *is.* [*ər.*] 1. Yağış yağanda su üstündə əmələ gələn qabarcıqlar.

2. *köhn.* Köpük. *Bu vilayət şahının qəlbi inam nöqtəsi; O da ki, su üzündə bir köpükdür, hübabdır.* Şəhriyar.

**HÜCEYRƏ** *is.* [*ər.*] *biol.* Canlı orqanizm quruluşunun protoplazma, nüvə və qişadan ibarət ən sadə vahidi. *Çünki hər dəqiqəniz; əvvəlkinə bənzəmir; Bədəndə hüceyrəniz; belə dəyişir hər an.* R.Rza.

**HÜCEYRƏARASI, HÜCEYRƏDAXİLİ** *sif. biol.* Hüceyrə toxumaları arasında olan. *Hüceyrəarası* (*hüceyrədaxili*) *maddə. – Tər şəklində bədəndən çıxan su əsasən hüceyrəarası mayedən və qandan ifraz olunur.*

**HÜCRƏ** *is.* [*ər.*] Məscid, təkyə, karvansara və s. yanındakı kiçik otaqlardan hər biri. *Mən Hacağa karvansarasının bir hücrəsində yaşayırdım.* S.Hüseyn.

**HÜCUM** *is.* [*ər.*] 1. İrəliləmək məqsədilə qoşunların düşmənə qarşı apardığı hərbi əməliyyat; həmlə. *Cəbhə boyu hücum. Düşmən üzərinə şiddətli hücum. Hücumun qabağını almaq. – Qala qoşunu düşmənin hücumunu dəf etməyə çalışırdı..* Çəmənzəminli. [Əmrah] *düşməni hücum əsnasında öldürdüyündən sevinirdi.* M.Hüseyn. ☐ **Hücum çəkmək** – 1) b a x **hücum etmək** 2, 3 və 4-cü mənalarda. *Sona əyri-əyri baxır Məşədi Zeynəbin üzünə və birdən onun üstünə hücum çəkib itələyir.* C.Məmmədquluzadə. *İllər ötdü, ölkəyə düşdü yenə qanqada; Fateh Sultan Süleyman hücum çəkdi Bağdada.* B.Vahabzadə; 2) hamı birdən bir şeyə tərəf sürüb getmək. *Camaat hücum çəkdi kassanın qabağına.* Ə.Haqverdiyev. **Hücum etmək** – 1) düşmənə qarşı fəal hərbi əməliyyat apararaq irəliləmək, həmlə etmək. *Diviziya düşmənə hücum etdi. – Sə-*

*fər də bir tərəfdən hücum edib, sağa-sola qılınc çalırdı.* Çəmənzəminli; 2) *məc.* pis niyyətlə bir şeyin və ya bir şəxsin üzərinə yürümək, üzərinə atılmaq, üstünə cummaq. *Sərxanın dəstəsi .. darvazaya hücum etdi.* M.Hüseyn; 3) birdən üstünə atılmaq. *Kəndin girəcəyində itlər bizə hücum etdi. Arılar üstümüzə hücum etdi*; 4) *məc. dan.* acgözlüklə yeməli bir şeyin üstünə döşənmək, tələsə-tələsə götürüb yemək. *Kababın üstünə hücum etdilər;* 5) *məc.* irəliləyərək böyük bir sahəni, ərazini tutmaq; basmaq, yayılmaq. *Sel tarlalara hücum etdi. – Qırmızı alov irəli hücum edir, .. buğda dərzlərini yandırıb məhv edirdi.* Ə.Vəliyev. *Dənizin şıltaq ləpələri hücum edib izləri yalayır.* H.Seyidbəyli. **Hücuma keçmək** – 1) ansızın hücum etmək, hücuma başlamaq. *Qoşunlar gecəyarı hücuma keçdilər.* [Qətibə:] *Rey qoşunu Qəzvin altına gəlmədən qabaq müharibəyə başlanmasın, hərgah azərbaycanlılar hücuma keçərsə, müdafiə halında durmalısınız.* M.S.Ordubadi; 2) birinə qarşı müdafiədən hücuma keçmək. *Ramazan hücuma keçib, usta Nemətin boğazını qurutmuşdu.* M.Hüseyn. *Hidayət açıq hücuma keçdi, qorxub çəkinmədi.* B.Bayramov. // Ələ keçirmək, yaxud xəsarət yetirmək və s. üçün üzərinə atılma. *Silahlı hücum. Canavarın qoyunlara hücumu.* // Basqın. *Quldurların hücumu. – Bu tədbir ilə mülki-İran taifeyi-biganənin hücumundan məhfuz qaldı.* M.F.Axundzadə. □ **Hücum etmək** – basqın etmək.

2. İttihamla, yaxud qərəzlə birinin üstünə düşmə, ağır sözlərlə üzərinə həmlə etmə. *Keflilik İskəndəri Şeyx Nəsrullahın fitvalarından, avamın hücumundan qoruyur, ölümdən saxlayır.* M.İbrahimov. // *məc.* Özünə tabe etmək və ya qarşısını almaq üçün göstərilən ciddi fəaliyyət, əməliyyat. *Kortəbii qüvvələr üzərinə hücum. Selə qarşı hücum genişlənir. Çəyirtkəyə qarşı hücum. – Pələng nərə çəkir hücumdan qabaq; Bir an da bir yerdə durmayaraq.* B.Vahabzadə.

3. *idm.* Futbol, xokkey, şahmat və s. oyunlarda: xal qazanmaq üçün daha fəal hərəkətə keçmə, irəliləməyə çalışma, mübarizəni gərginləşdirmə, rəqibi sıxışdırma. *Mərkəz hücumçusunun hücumu. Boksçunun gözlənilməz hücumu. Atla şah cinahına hücum. – Fəxrəddin hücum başlandığını görüncə, topu havaya tullayaraq Alacanı mahmızladı.* M.S.Ordubadi.

**HÜCUMÇU** 1. *sif. hərb.* Hücum üçün olan, hücum edən. *Hücumçu dəstə. Zirehli hücumçu təyyarələr.* // *is.* Hücum edən qoşun hissəsi, tank dəstəsi, təyyarə və s. *Bu yanda hazırlanır; Döyüşə hücumçular.* R.Rza.

2. *is. idm.* Hücum xəttində oynayan idmançı (futbolda, xokkeydə və s.). *Hücumçu ilə yarımmüdafiəçilərin əlbir oyunu.*

**HÜD-HÜD** b a x **şanapipik**. *Şahlıq tac ilə olmaz, əldə cami-Cəm gərək; Yoxsa vardır, ey pərivəş, hüd-hüdün başında tac.* S.Ə.Şirvani.

**HÜDUD** *is.* [*ər.* "hədd" söz. cəmi] 1. Sərhəd. *Vətənin hüdudlarını qorumaq. –* [Qızıl Arslan:] *Atabəy Məhəmməd sənin tərəfindən vəkil ediləndən bəri məmləkətin hüdudlarını Kirmana qədər genişləndirmişdir.* M.S.Ordubadi.

2. Hədd, ölçü, hədd-hüdud. *Uşağın sevincinin hüdudu yox idi. – Hüdudu var hər ağrının, hər işgəncənin; Külək yatır, qar dayanır, açılır səhər.* S.Vurğun. *Xeyir-şər qol-qola! Nə yüksəkliyin; Nə də alçaqlığın hüdudu yoxmuş.* B.Vahabzadə.

**HÜDUDLAMA** "Hüdudlamaq"dan *f.is.*

**HÜDUDLAMAQ** *f.* Hüdud qoymaq, hüdudunu müəyyən etmək, sərhəd çəkmək, hədd qoymaq.

**HÜDUDSUZ** *sif.* Həddi-hüdudu olmayan, ucsuz-bucaqsız, sonsuz. *Hüdudsuz okean. Hüdudsuz səma. – Uydurmanın; Riyanın; Gah əskilən, gah artan; Hüdudsuz arşınıyla; Həqiqət ölçülərmiş...* B.Vahabzadə.

**HÜDUDSUZLUQ** *is.* Həddi, hüdudu olmama, sonsuzluq.

**HÜKƏMA** *is.* [*ər.* "həkim" söz. cəmi] *klas.* Hikmət və fəlsəfə alimləri; alimlər. *Avropalılar da axır vaxtadək bu məsələ ilə məşğul idilər, hükəma arvadın beynini ölçüb-biçməyə, tərəziyə qoyub çəkməyə vaxtını sərf eləyiblər.* Çəmənzəminli.

**HÜQUQ** *is.* [*ər.* "həqq" söz. cəmi] 1. Dövlət tərəfindən müəyyən olunan və tətbiq edilən, insanlar arasında ictimai münasibətləri nizama salan və hakim sinfin iradəsini

ifadə edən normaların, qaydaların məcmusu. *Seçki hüququ. – İnsan hüququndan dərs deyən ölkə; Haqqı bağ güncünə niyə atmısan?* B.Vahabzadə. // Cəmiyyətin təşkilinin, həyat və fəaliyyətinin hər hansı bir cəhətinə aid olan dövlət hüquq və qərarlarının məcmusu. *Əmək hüququ. Mülki hüquq. Vətəndaşlıq hüququ.* // Hər hansı bir məsələyə dair dövlətlər arasındakı qarşılıqlı münasibətləri nizama salan beynəlxalq sazişlərin, müqavilələrin məcmusu. *Dəniz hüququ.* // Həmin qayda və normalar haqqındakı qanunlardan bəhs edən elm və onun bu və ya başqa bir sahəsi. *Mülki hüquq mütəxəssisi. Cinayət hüququndan mühazirə. Hüquq elmləri doktoru. – Mehman sənədlərini təqdim edib hüquq fakültəsinə daxil oldu.* S.Rəhimov.

2. Bir iş görmək, bir şeyi həyata keçirmək üçün dövlət qanunları ilə verilən azadlıq, imkan, ixtiyar. *Vətəndaşların hüquqları. Fəhlə sinfinin siyasi hüquqları. Sosial təminat hüququ. Varislik hüququ. – Asudə nəfəs çəkməyə halət edə fəhlə; Yainki hüquq üstə ədavət edə fəhlə.* M.Ə.Sabir. *Və yenə də biz başa düşmürük ki, osmanlı arvadları nə hüquq istəyirlər?* C.Məmmədquluzadə. // Birisinə vəzifəsini yerinə yetirmək, müəyyən vəzifə tutmaq ixtiyarını verən rəsmi icazə, vəsiqə. *Müəllimlik hüququ.* // *dan.* Hər hansı bir şəxsə avtomobil, motosiklet və s. sürmək ixtiyarı verən sənəd. *Sürücülük hüququ.*

3. Bu və ya başqa bir tərzdə hərəkət etmək, iş görmək imkanı; ixtiyar. *Yeni təyin edilmiş müdirə böyük hüquqlar verilmişdir.* – [Cahan:] *İmdi bizim hüququmuz kişilərlə bərabərdir*. Ə.Haqverdiyev.

4. Əsas, sübut, haqq. *Bu adı daşımağa heç bir hüququ yoxdur.*

5. *köhn.* Əmək haqqı, zəhmət haqqı; maaş, aylıq, donluq. *..Həmin uşqolda həftədə iki saat şəriət dərsi deyib, ayda on iki manat yarım hüquq alasınız.* C.Məmmədquluzadə.

◊ **Hüquq məsləhətxanası** – əhaliyə hüquq məsələlərinə dair məsləhətlər vermək üçün vəkillər kollegiyası şöbəsi. **Hüquq məsləhətçisi** – bir idarənin, müəssisənin və s.-nin hüquq məsələlərinin praktik həlli ilə məşğul olan və hüquq təşkilatlarında (arbitrajda, məhkəmədə və s.) onun mənafeyini müdafiə edən hüquqçu.

**HÜQUQÇU** *is.* 1. Hüquq sahəsində praktik işçi. *Məhkəmənin hüquqçusu.*

2. B a x **hüquqşünas**.

**HÜQUQİ** *sif.* [*ər.*] 1. Hüquqa əsaslanan, hüquq normalarına uyğun olan. *Hüquqi münasibətlər. Hüquqi qayda. – Qanımızı tökənə bundan sonra yenə də; Biz inanaq, ay Allah? Budurmu yaratdığı təzə hüquqi dövlət?* B.Vahabzadə.

2. Hüquq normaları, hüquq qanunları və onların praktik tətbiqi ilə bağlı olan. *Hüquqi əsaslar. Hüquqi normalar. Məsələnin hüquqi incəlikləri.*

3. Bir işi görməyə rəsmi hüququ, ixtiyarı olan: hüquqlu. *Mülkün hüquqi sahibi.*

◊ **Hüquqi şəxs** – müəyyən hüquq və vəzifələri təmsil edən idarə, müəssisə və ya təşkilat.

**HÜQUQLU** *sif.* Hüququ olan, hüquqdan istifadə edən.

**HÜQUQSUZ** *sif.* və *zərf* Siyasi və vətəndaşlıq hüququ olmayan, hüquqlardan məhrum, hüququ əlindən alınmış. *Nə bilim bir düha doğuracaqmış; Hüquqsuz ömrünün acı qışları..* M.Müşfiq. *Əsrlərdən bəri hüquqsuz yaşayan bir xalq, nəhayət, azad nəfəs ala bildi.* M.İbrahimov.

**HÜQUQSUZLUQ** *is.* Siyasi və ictimai hüququn olmadığı hal, hüquqsuz adamın hal və vəziyyəti.

**HÜQUQŞÜNAS** *is.* [*ər.* hüquq və *fars.* ...şünas] Hüquqşünaslıq mütəxəssisi; hüquqçu. *Hüquqşünasların elmi sessiyası. Alim-hüquqşünas.* – [Anası Vahidə:] *Mən istəyirdim ki, sən hüquqşünas olasan!* B.Bayramov.

**HÜQUQŞÜNASLIQ** *is.* 1. Hüquq elmlərinin məcmusu. *Azərbaycan hüquqşünaslığı.*

2. Hüquqşünasın ixtisası, sənəti, peşəsi. *Hüquqşünaslıqla məşğul olmaq.*

**HÜLQUM** *is.* [*ər.*] *anat.* Həzm cihazının, ağız boşluğunu qida borusu ilə birləşdirən əzələ borusu. *Pazaq Vəli təəccübdən yerində donub qaldı. Boğazının nazik dərisini az qala deşib çıxan hülqumu tez-tez enib*

*qalxdı.* İ.Məlikzadə. // Ümumiyyətlə, boğaz mənasında da işlədilir.

◊ **Hülqumu qurumaq** – bərk qorxmaq, qorxudan özünü itirmək. **Hülqumundan yapışmaq** – boğazından yapışmaq, hülqumlamaq. **Hülqumundan keçirmək** – bax **həzm-rabedən keçirmək** ("**həzm**"də). **Hülqumunu üzmək** – öldürmək. [Əsgər:] *Tapaq, birdəfəlik onun hülqumunu üzək.* Ə.Əbülhəsən.

**HÜLQUMLAMA** "Hülqumlamaq"dan *f.is.*

**HÜLQUMLAMAQ** *f.* Hülqumundan tutmaq, boğazından yapışmaq, boğazlamaq.

**HÜMAYUN** [*fars.*] 1. *is.* Azərbaycan klassik muğamlarından birinin adı. *Millәndi qığılcım kimi zülmətdə hümayun; Dağ üstünə dağ basdı müsibətdə hümayun; Ülviyyətə, qüdsiyyətə, şeyriyyətə çatmış; Fəryadda Segah, gizli şikayətdə hümayun.* B.Vahabzadə.

2. *sif.* Uğurlu, məsud, mübarək mənasında olub, keçmişdə padşahlar, sultanlar və onlarla bağlı şeylər haqqında deyilən söz. [Vəliəhd şahzadə haqqında:] *Bu xəyanətkarın xəyanəti nəticəsində uzun müddətdir ki, əlahəzrət hümayuna gecə-gündüz yuxu haram olmuşdu.* P.Makulu.

◊ **Hümayun ağı** *köhn.* – qalın ağ parça növü. *Vəzir .. bir erkəyi öldürtdürüb, hümayun ağına bükdürdü.* "Qurbani". [Əsəd kişi:] *Hümayun ağıdır, on beş arşın, məni ona bükərsiniz.* B.Bayramov.

**HÜMMƏT** *is.* [*ər.*] Cəhd, səy, qeyrət, əl-ələ verib çalışma, təşəbbüs. *El hümməti, el qüdrəti vardır qolumuzda; Bir gün alarıq biz bu qisası yenə səndən.* Ə.Vahid. // Yardım, kömək, qeydkeşlik. □ **Hümmət etmək** – 1) çalışmaq, səy etmək, cəhd etmək, qeyrət göstərmək, əl-ələ vermək, təşəbbüs göstərmək. *..Ümid var ki, İrəvan əhli hümmət edib, az zamanda məktəblərin hər bir mayehtacını düzəldələr.* F.Köçərli. [Hacı:] *Şamaxılı Şamaxıdan, gəncəli Gəncədən, şəkili Şəkidən, nə ki imkan var hümmət eləyək..* Mir Cəlal; 2) kömək etmək, yardıma qoşmaq, əlindən tutmaq. [Kərəm:] *Dağlar, hümmət edin, burda qalmayım; Qalırsam da qürbət eldə ölməyim.* "Əsli və Kərəm".

**HÜNDÜR** *sif.* 1. Uca, yüksək. *Hündür divar. Hündür dağ. Hündür boy. – Çay hündür və yaşıl təpələrin arasilə axıb gedir.* M.İbrahimov. *İri, qol-budaqlı, hündür tut ağacının altında manqal qoyulmuşdu.* İ.Hüseynov.

2. Ucaboy(lu), hündürboy(lu). *Hündür kişi.* – [Camal] *atası kimi hündür, enlikürək bir oğlandı.* S.Vəliyev. *Əlləzoğlu cırtdan gövdəsini çəkib, bu iri, qol-budaqlı, hündür adamın* [Səmədin] *qarşısında özünü yığışdırdı.* İ.Hüseynov.

3. Müqayisədə işlənir. *Bu bina o binadan hündürdür. Ev həyətin divarından hündürdür. – O, Teymurdan bir daban hündürdü.* M.Hüseyn.

**HÜNDÜRBOY(LU)** *sif.* Boyu hündür olan; ucaboy(lu), boylu-buxunlu. *Hündürboy(lu) gənc. – Minayə hündürboylu, qarayanız, incə bir arvaddı.* Ə.Əbülhəsən. *..Kərimov əlli yaşlarında, gözəlsifətli, hündürboy bir kişi idi.* H.Seyidbəyli.

**HÜNDÜRCƏ** *sif.* Bir az, bir qədər hündür, uca. *Hündürcə barı. Hündürcə kişi.* // Çox hündür, çox uca. *Hündürcə bir təpə.*

**HÜNDÜRDƏN** *zərf* 1. Çox hündürdə; ucadan, yüksəkdən. *Təyyarə hündürdən uçurdu.*

2. Səsini ucaldaraq; ucadan, bərkdən. *Hündürdən gülmək. – Katib qırmızı karandaşı əlinə alaraq, qarşısındakı kağızda yazılan adları bir-bir hündürdən oxumağa başladı.* Ə.Sadıq. *Hamı hündürdən danışdığı üçün ağız deyəni qulaq eşitmirdi.* B.Bayramov.

**HÜNDÜRLÜK** *is.* 1. Hündür şeyin halı; ucalıq, yüksəklik. *Divarın hündürlüyü. Ağacın hündürlüyü.*

2. Rəqəmlərlə: bir şeyin yerdən, oturacaqdan, səthdən ən yüksək nöqtəsinə qədər olan məsafə. *Evin hündürlüyü. Üçbucağın hündürlüyü. – Yüz addım keçdikdən sonra bir sajın hündürlükdə açıqlıq bir təpəyə çatdıq.* H.Nəzərli.

3. Hündür yer; təpə, təpəlik. *Hündürlükdə ot biçmək. – ..Bülənd atı bir hündürlüyün yanına çəkərək, atın üstünə tullandı.* Ə.Əbülhəsən.

**HÜNDÜRLÜKÖLÇƏN** *is.* Hündürlüyü ölçmək üçün cihaz. *Təyyarənin hündürlükölçəni. Hündürlükölçənin göstəricisi.*

**HÜNƏR** *is.* [*ər.*] 1. Bacarıq, məharət, ustalıq, qabiliyyət, fərasət. *Belə bir işi görmək*

*üçün hünər lazımdır. – ..Hamı pəhləvanlarımız öz hünərlərini çıxartdılar meydana..* C.Məmmədquluzadə. *Sənət bir hünərdir, bəli, bir hünər; Ayağın qoy alsın gücünü yerdən.* N.Xəzri. ◻ **Hünər etmək** – 1) b a x **hünər göstərmək**. [Qoca kəndli:] *Bunun yarısını əkə bilsək, böyük hünər eləmiş olarıq.* Ə.Haqverdiyev; 2) cəsarət etmək, şücaət göstərmək. **Hünər göstərmək** – öz ustalığını, məharətini, bacarığını nümayiş etdirmək. *Şiraslan belə bir iş görmək, bir hünər göstərmək istəyirdi.* S.Rəhimov. *Bəs Yaşar necə bir hünər göstərmişdi ki, ona bu cür ad qoymuşdular?* M.Rzaquluzadə. **...hünəri deyil** – bacarmaz, edə bilməz, əlindən gəlməz. *Gilavarın xətir-hörmət nəzərə almadığı belə bir zamanında .. hətta .. daldalarda gəzmək hər oğulun hünəri deyildi.* B.Bayramov.

2. Çətin şəraitdə mühüm bir işi, tədbiri, tapşırığı həyata keçirmək üçün rəşadət, şücaət, qoçaqlıq, fədakarlıq. – [Koroğlu:] *Aləmə bəlli hünərim; Çənlibeldə dəlilərim; Mərd igidə peşkəş sərim; Qaçırtmaz meydandan məni.* "Koroğlu". *Nə zaman ki, uçan bir qız seyrə çıxar göyləri; Ağızlardan-ağızlara gəzər onun hünəri.* S.Vurğun. ◻ **Hünər göstərmək** – qəhrəmanlıq etmək, qoçaqlıq, igidlik göstərmək. *Qolac qollarımı gərrəm; Meydanda hünər göstərrəm.* "Koroğlu". *Oğlum bu gün cəbhədədir, nərə çəkir bir nər kimi; Mənim gənclik illərimdə göstərdiyim hünər kimi.* S.Vurğun.

3. *klas.* Sənətkarlıq, ustadlıq, istedad. *Hünər sahibi. – Alimin ki özündə yoxdur hünər; Eləməz bir kəsə kəlamı əsər.* S.Ə.Şirvani. *Ustadın işin, işlədiyin xam nə bilsin? Elmin, hünərin qiymətin islam nə bilsin?* M.Ə.Sabir.

**HÜNƏRLƏNMƏ** "Hünərlənmək"dən *f.is.*

**HÜNƏRLƏNMƏK** *f.* Qeyrətə gəlmək, cəsarətə gəlmək, ürəklənmək.

**HÜNƏRLİ** *sif.* və *is.* 1. Bacarıqlı, məharətli, qabiliyyətli, qeyrətli, əlindən iş gələn. *Hünərsiz özgəyə güvənər, hünərli özünə.* (Ata. sözü).

2. Qoçaq, igid, cəsur, cürətli. *Gündüzlər hünərli görünən qazaq; Qaranlıq düşəndə olur yapalaq.* H.K.Sanılı. *Bayındır xan misilsiz bir bayram şənliyi qurmuş, sağında-solunda .. hünərli ərlər durmuşdular.* M.Rzaquluzadə.

**HÜNƏRMƏND** *sif.* [*ər.* hünər və *fars.* ...mənd] *klas.* b a x **hünərli**. *Biz qoca qafqazlı igid ərlərik; Cümlə hünərməndlərik, nərlərik.* M.Ə.Sabir.

**HÜNƏRSİZ** *sif.* Hünəri olmayan, hünəri çatışmayan, hünər göstərə bilməyən; bacarıqsız, qabiliyyətsiz, istedadsız, fərsiz, fərasətsiz. *Hünərsiz adam. – Elmsiz kimsənə hünərsizdir; Elmi-bitərbiyət səmərsizdir.* S.Ə.Şirvani. *O insandır ki, hər haqqı, nəsibi qəhrəmanlıqdır; Hünərsiz millətin yurdu günəşsiz bir qaranlıqdır.* S.Vurğun.

**HÜNƏRSİZLİK** *is.* Bir işi görməyə hünəri, bacarığı, cəsarəti, qabiliyyəti, fərasəti, biliyi çatışmamaq.

**HÜNƏRVƏR** *sif.* və *is.* [*ər.* hünər və *fars.* ...vər] 1. Hünərli, mərifətli, məharətli, qüdrətli, ustad. *Hünərvər insana hörmət və ehtiram göstərilməlidir. – Amma mən elə qanıram ki, Sabir kimi hünərvər şairin qabağına çıxmaq o qədər də asan olmaya gərək.* C.Məmmədquluzadə.

2. Şücaətli, qoçaq, igid, qorxmaz. *Hünərvər əsgər. – Zəncir tək düzülüb on beş hünərvər.* H.K.Sanılı. *Fürsəti vermədən əyləşir yerə; Ölüm heyrət edir o hünərvərə.* M.Rahim.

**HÜNÜ** *is. məh.* Ağcaqanadın adlarından biri. *Bir yan, görürsən, uşaqlar oynaşır; Milçək vızıldaşır, hünü qaynaşır.* A.Səhhət.

**HÜRDÜRMƏ** "Hürdürmək"dən *f.is.*

**HÜRDÜRMƏK** *f.* Hürməsinə səbəb olmaq, hürməyə məcbur etmək. *İti qısdırıb hürdürmək.*

**HÜRƏYƏN** *sif.* Çox hürən, boş-boş hürən (it haqqında). *Hürəyən it.*

**HÜRGÜC** *is.* Bəzi heyvanların (məs., dəvənin) belində piy yığınından əmələ gələn bir və ya iki çıxıntı. *O karvanlar ki, caydaq dəvələrin hürgücləri dərisi qapqara tuluqlarla yüklü olurdu, onlar keçdikləri kəndlərə, obalara o şəhərin göndərdiyi işığı paylaya-paylaya baş alıb günbatana doğru gedərdilər.* Ə.Məmmədxanlı.

**HÜRKDÜRMƏ** "Hürkdürmək"dən *f.is.*

**HÜRKDÜRMƏK** *f.* bax **hürkütmək**. *Qoyunu hürkdürmək. Quşları hürkdürmək.*

**HÜRKƏK** bax **ürkək**. [Gəray:] *Barı, ram oldumu hürkək ceyran?* A.Şaiq.

**HÜRKƏKLİK** bax **ürkəklik**.

**HÜRKMƏ** "Hürkmək"dən *f.is.*

**HÜRKMƏK** *f.* Gözlənilməz səsdən, adamdan və s.-dən qorxub çəkilmək və ya qaçmaq; ürkmək, qorxmaq (heyvanlar və quşlar haqqında). *Sərçələr maşın səsindən hürküb uçdu. – Dəvələr hürkərək bir-birinə dəyib bütün yolu tuturdular.* M.İbrahimov. *..Qağayılar hürküb qayadan uçmuşdu.* S.Vəliyev. // Eyni mənada adam haqqında. *Qaranlıqdan hürkmək.* – [Fərman Mələyə:] *Bilirəm, sən məndən hürkürsən.* M.İbrahimov. [Bəhlul:] [Əjdər] *elə bil hürkürdü, nədənsə çəkinirdi.* B.Bayramov.

**HÜRKÜ** *is.* Qorxu, ürkü. *Aslanam, deyiləm tülkü; Tanımaram qorxu, hürkü.* "Koroğlu".

**HÜRKÜŞMƏ** "Hürküşmək"dən *f.is.*

**HÜRKÜŞMƏK** *f.* Hürkmək, qorxmaq, ürküşmək (çoxları haqqında). *Qoyunlar hürküşdü. – Vəhşi ahular ovçunu görən kimi hürküşməyə başladılar.* M.S.Ordubadi. *O, səsini çıxardan tək; Quşlar uçur hürküşərək.* M.Dilbazi.

**HÜRKÜTMƏ** "Hürkütmək"dən *f.is.*

**HÜRKÜTMƏK** *f.* Hürkməsinə səbəb olmaq; hürkdürmək, ürkütmək, qorxutmaq. *Qoyunları hürkütmək. – ..Səs emalatxananın dalında cərgələnmiş sığırçınları hürkütdü.* M.Hüseyn. // Eyni mənada adam haqqında. [Uşaqları] *bu sözlər hürküdürdü.* Mir Cəlal. [Seymur:] *Mən onu hürkütmək istəmirdim.* H.Seyidbəyli.

◊ **Hürkütməsən saymaq (sanamaq) olmaz** – çoxuşaqlı ailə haqqında zarafatla işlədilir. [Ata:] *Bizdə elədir ki, hürkütməsən sanamaq olmaz.* S.Rəhimov.

**HÜRMƏ** "Hürmək"dən *f.is.*

**HÜRMƏK** *f.* 1. Kəsik-kəsik səs çıxarmaq (it, tülkü və bəzi başqa heyvanlar). *Səssəmir yox idi, ancaq hərdənbir zorba həyət iti hürürdü.* N.Nərimanov. *Bir neçə qədəm getmişdim ki, qarşıma bir tüklü qara it çıxdı. İt hürməyə başladı.* T.Ş.Simurq.

2. *məc. kob.* Söyləmək, yava danışmaq. *Bəsdir hürdün!*

**HÜRR** *sif.* [*ər.*] Azad. *Sakit küçələr* [Midhədə] *geniş göründü, əsir şəhər hürr və məsrur idi.* Çəmənzəminli. □ **Hürr olmaq** – əsarətdən, zülmdən xilas olmaq, azad olmaq, azadlığa çıxmaq. *Yarın hürr olacaq hər qolu bağlı; Ruzgarlar əsəcək sənin yerində.* M.Müşfiq.

**HÜRRİYYƏT** *is.* [*ər.*] Azadlıq. *Bəşərin dərdini öz dərdi bilib millətimiz; Bizim öz niyyətimizdən doğub hürriyyətimiz.* B.Vahabzadə.

**HÜRRİYYƏTPƏRƏST** [*ər.* hürriyyət və *fars.* ...pərəst] bax **azadlıqsevən**. *Hürriyyətpərəst müsəlmanlar millət bahadırı Səttarxanı tərif və təhsin edirlər.* F.Köçərli.

**HÜRRİYYƏTPƏRƏSTLİK** bax **hürriyyətpərvərlik**.

**HÜRRİYYƏTPƏRVƏR** [*ər.* hürriyyət və *fars.* ...pərvər] bax **azadlıqsevər**.

**HÜRRİYYƏTPƏRVƏRLİK** *is.* Hürriyyəti, azadlığı sevmə; azadlıqsevərlik.

**HÜRUF** *is.* [*ər.* "hərf" söz. cəmi] *klas.* Hərflər.

**HÜRUFAT** *is.* [*ər.* "hüruf" söz. cəmi] Hərflər, əlifba. *O hürufat ilə ki, biz yazırıq, onu oxumaq çətin bir məsələdir.* C.Məmmədquluzadə. *Döndərib "a-ba"yə "əlif-bey"ləri; Bidətə bax, "ya" oxudur "yey"ləri; Sanki hürufat ilə düşməndı bu!* M.Ə.Sabir.

**HÜRUFİ** *is.* [*ər.*] Hürufilik təriqəti tərəfdarı. *Hürufi şairlər.*

**HÜRUFİLİK** *is.* XIV əsrdə Azərbaycanda meydana gəlmiş, Quranın hərflərindən bir sıra məna və hökmlər çıxaran təriqət.

**HÜRÜŞ** *is.* İtin, tülkünün və b. heyvanların çıxardığı kəsik-kəsik səs: hürmə səsi. *İtin hürüşü. Hürüş səsi. – Ancaq yabana hürən köpəklərin xır-xırı, hürüşü kəsmə-kəsmə eşidilirdi.* S.M.Qənizadə. *Əjdər Toplanın hürüşünü eşidirdi.* S.Rəhman.

**HÜRÜŞMƏ** "Hürüşmək"dən *f.is.* *Ov tularına qoşulmuş Qara köpək mağaraya girdi, bunun dalınca başqa itlər də getdilər və yenə də içəridə hürüşmə başlandı.* S.S.Axundov. *Bu zaman daxmanın qapısı şiddətlə döyüldü, bayırdan at kişnəmələri və it hürüşmələri eşidildi.* M.Rzaquluzadə.

**HÜRÜŞMƏK** *qarş.* Səs-səsə verərək hürmək, hamı birdən hürmək. *Kəndin itləri*

*hürüşüb, hər tərəfdən süvarinin üstünə tökülüşdülər.* E.Sultanov. *Birdən eşikdə itlər ağız-ağıza verib hürüşdülər.* M.Hüseyn.

**HÜSEYNİ** *is.* [*ər.*] Azərbaycan klassik muğamlarından birinin adı.

**HÜSN** *is.* [*ər.*] 1. Gözəllik, camal. *O gözəlin hüsnündəki; Əzəməti şeirə gətir; Qəlbindəki çırpıntını; Hərarəti şeirə gətir.* M.Araz. // *köhn. kit.* Özündən sonra gələn sözə gözəllik, yaxşılıq, məqbulluq, müsbətlik mənası verir; məs.: hüsn-qəbul (yaxşı qəbul, gözəl qarşılama), hüsn-niyyət (yaxşı niyyət).

2. *məc.* Ləzzət, dad. *İlin hər fəslinin bir hüsnü var; amma qışın ləzzəti bir özgədir.* C.Məmmədquluzadə. *Burda min bir od yanarmış; Onun da öz hüsnü varmış.* S.Vurğun.

**HÜSNXƏT** *is.* [*ər.*] İbtidai məktəbdə, şagirdlərdə gözəl yazmaq vərdişləri aşılamaq üçün keçilən tədris fənni. *Hüsnxət dərsi. Hüsnxət dəftəri. – Müəllimlərin əksəriyyətinin hüsnxət qaydalarından xəbəri yoxdur, hərflərin ünsürləri və tənasübü haqqında məlumatsızdırlar.* M.İbrahimov.

**HÜSN-RƏĞBƏT** *is.* [*ər.*] Yaxşı, xeyirxah, xoş münasibət. ◻ **Hüsn-rəğbət bəsləmək** – xoş, xeyirxah, yaxşı münasibət göstərmək. *Hüsaməddin Qətibənin .. Atabəy Məhəmməddən intiqam almaq fikirlərinə hüsn-rəğbət bəsləyirdi.* M.S.Ordubadi. **Hüsn-rəğbətini qazanmaq** – hər hansı bir münasibətlə birində özünə qarşı xoş, xeyirxah, yaxşı münasibət, sevgi hissi oyatmaq. [Rəşid:] *Qurbanqulu hünəri və məhəbbəti sayəsində cümlə kəndin hüsn-rəğbətini qazanmışdı.* T.Ş.Simurq. *Zabit qəhrəmananə bir vəziyyətlə Nəsir bəyin evindən çıxdı. Nəsir bəyin hüsn-rəğbətini qazanmaq böyük səadətdi!* Ə.Haqverdiyev.

**HÜZN** *is.* [*ər.*] 1. Kədər, qəm, qüssə. *Bu səs insana hüzn gətirir. – Durnaların oxumağı Vaqifə hüzn gətirməyir və könlünü pərişan qılmayır..* F.Köçərli. *Yoxsa hüzn dolu qəmgin səsində; Dostumun muradı, ürək sözü var?* M.Rahim.

2. **Hüznlə** şəklində *zərf* – kədərlə, qüssə ilə: qəmli, kədərli, qüssəli. *Hüznlə oxumaq. Dərin hüznlə başsağlığı vermək.* – [Gülsənəm] *ağır-ağır nə isə çox dəruni bir hüznlə dedi..* M.Hüseyn. *Şahmargil başlarını aşağı salıb hüznlə dayandılar.* B.Bayramov.

**HÜZNAVƏR** *sif.* [*ər.* hüzn və *fars.* ...avər – gətirən] *klas.* b a x **hüznlü**. [Qətibə] *əlvan çiçəkli xiyabanlar məhv olan bir xalqın yadigarı kimi qalan köhnə qəbiristanlardan daha qorxulu və hüznavər idi.* M.S.Ordubadi.

**HÜZNLÜ** *sif.* Qəmli, kədərli; qüssəyə, qəmə, kədərə batmış. *Dizini qucaqladığı halda oturmuş hüznlü ana .. ayağa qalxdı.* Ə.Əbülhəsən. // Qəm, kədər, hüzn doğuran, kədər ifadə edən, kədərləndirici, məhzun. *Hüznlü nəğmə. – Meşənin hüznlü iniltiləri; Küləyin naləli vıyıltıları; Ölü ağlaşmasın salır yada; San sızıldar tamam əşya da.* A.Səhhət.

**HÜZR** "Üzr" sözünün canlı dildə işlənən forması (b a x **üzr** 4-cü mənada). *Hüzr yerinə gələnlər ev sahibinə başsağlığı verib dağılanda Molla Sadıqla Cahandar ağanın baxışları ani olaraq bir-birinə sancıldı.* İ.Şıxlı. ◻ **Hüzr yeri** – b a x **üzr yeri** ("**üzr**"-də). *Hüzr yerinə getmək.* – [Nərminə] *anası-atası ilə Əsəd babanın hüzr yerinə gəldi.* B.Bayramov.

**HÜZUR** *is.* [*ər.*] *klas.* 1. Ön, qabaq, pişgah. ◻ **Hüzur(u)na** – yanına, qabağına, önünə. *Hüzuruna çağırmaq. Hüzuruna gəlmək. Hüzuruna heç kəsi qəbul etmir.* – [Pirverdi bəy Kəblə Qulaməliyə:] *Bu saat oğlun Mustafanı, get, gətir cənab nəçərnikin hüzuruna.* C.Məmmədquluzadə. [Vaqif:] *Axund, xanın hüzuruna getmək çağı deyilmi?* Çəmənzəminli. **Hüzurunda** – yanında, qabağında, önündə. *Hüzurunda oturmaq. Hüzurunda danışmaq. – Xidmətçilər Hüseynqulu ağadan qorxub hüzurunda titrəyirdilər.* S.S.Axundov. *Gör nələr yaradır hökmü dövranın; Leyla hüzurunda dayanmış xanın.* B.Vahabzadə. **Hüzurundan** – yanından, qabağından, önündən. *Elə ki məclis qurtardı, hamı dağıldı, Cünun da durub paşanın hüzurundan mürəxxəs oldu.* "Koroğlu".

2. Hazır olma, orada olma. *Hiss edirdim ki, mənim hüzurum və söhbətim* [Ağaverdini] *narahat edir.* S.Hüseyn.

# Xx

**X** Azərbaycan əlifbasının on ikinci hərfi. bax **xe**.

**XAB** *is.* [*fars.*] *klas.* 1. Yuxu. *Gecələr gözlərim xabı görməmək; Ol siyah nərgisi-məstanədəndir.* M.P.Vaqif. *Dayansın qarşıda, gətirsən tabı; Ayıltsın qəflətdən, unutsun xabı.* Aşıq Ələsgər. ☐ **Xabi-qəflət** *klas.* – bax **qəflət yuxusu** ("**qəflət**"də). *Ey qafil xortdan, bu nə xabi-qəflətdir ki, uyubsan?* Ə.Haqverdiyev. *Sənə molla çalır lay-lay, yatırdır xabi-qəflətdə; Səni yar eləyir hurilər ilə baği-cənnətdə.* Ə.Nəzmi. [Dərviş:] *Başərsən, zəhmətkeşsən, halını qan, ömrünə yan, olma biiman, xabi-qəflətdən oyan, – dəmbədəm deyən Ruqiyyə idi, Ruqiyyə.* A.Divanbəyoğlu.

2. *məc.* Qəflət yuxusu, cəhalət, avamlıq. ☐ **Xabi-cəhalət** *klas.* – bax **xabi-qəflət**. *Tərpənmə, amandır, bala, qəflətdən ayılma; Açma gözünü, xabi-cəhalətdən ayılma.* M.Ə.Sabir.

**XABANÉRA** [*isp.*] İspaniyada geniş yayılmış Kuba xalq rəqsi və onun havası.

**XACƏ[1]** *is.* [*fars.*] *köhn.* Sarıqlı əfəndi, molla, seyid. *Ey xacə, çalış surəti-zahirdə qəşəng ol! İstərsən özün surəti-mənada cəfəng ol!* M.Ə.Sabir.

**XACƏ[2]** *is.* [*fars.*] bax **xədim** 1-ci mənada. *Cariyələr Qətibənin yanında gələn iki nəfər xacəni qıdıqlayıb gülürdülər.* M.S.Ordubadi. ☐ **Xacə eləmək** – bax **xədim eləmək** ("**xədim**"də). [Səttarxan Bağırxana:] *..Gördüyümüz o dəhşətli mənzərələr, o burun-qulaqlar, o kəsik başlar, xacə elədikləri o yazıq adamın nərəsi .. gözümün qabağında canlanırdı.* P.Makulu.

**XACƏBAŞI** *is. köhn.* Keçmişdə: hərəmxana qadınlarına nəzarət edən xədimlərin başçısı. *Bir neçə gün keçdi. Bir sübh sərdarın hərəmxanasının xacəbaşısı gəlib baş əyib məyus dayandı*. Ə.Haqverdiyev.

**XAÇ** *is.* Xristianlığın rəmzi sayılan və bir-birini perpendikulyar olaraq qət edən iki mildən ibarət sitayiş obyekti. *Kilsələrin xaçları. Ağac xaç.* – [Xanım] *soyuq əlləri ilə boğazındakı xaçından bərk-bərk yapışdı, dua oxudu, Allahı çağırdı... Lakin ruhuna sükun gəlmədi.* Çəmənzəminli. ☐ **(Boynundan) xaç asmaq, (boynuna) xaç salmaq** – dönüb xristian olmaq, xristianlığı qəbul etmək. [Müridlər:] *Şeyximiz satdı dini, imanı; Öncə islama bir mürəvvic ikən; Xaç asıb çıxdı dinü məzhəbdən.* H.Cavid. *Dinindən əl çəkib o Şeyx Sənan; Boynuna bir anda xaç salmadımı?* B.Vahabzadə. **Xaç vurma (çəkmə)** – xristianlarda: icra edilən dini ayin. *Bu zaman yanımdan ötən bir qarı; Üz tutub qəbrə baxır, xaç vurur.* M.Rahim. *Bacıların hər ikisi ayağa durub xaç çəkdi.* Mir Cəlal. **Xaç yürüşləri** – bax **səlib müharibələri** ("**səlib**"də). **Xaç suya salma** – İsanın dara çəkilməsi xatirəsinə olaraq xristianların yanvarın 6(19)-da xaçı suya salmaq şəklində icra etdikləri dini ayin (mərasim).

2. Xaç şəklində olan nişan, orden və s.

◊ **Qırmızı Xaç və Qırmızı Aypara cəmiyyəti** – müharibədən və təbii fəlakətdən zərər çəkmiş əhaliyə yardım göstərmək üçün təşkilat.

**XAÇAÇURAN** *is.* Xristian dini mərasimlərindən birinin adı, xaçı suya salma. *Xaçaçuran bayramı.*

**XAÇÇİÇƏKLİ(LƏR)** *is. bot.* Ləçəkləri xaç şəklində olan bitkilər fəsiləsi. *Xaççiçəklilər fəsiləsinə bir sıra kələm, turp, vəzəri kimi qiymətli tərəvəz bitkiləri, xardal kimi yağlı bitkilər, mixəkgülü, şəbbugülü kimi bəzək bitkiləri daxildir.* H.Qədirov.

**XAÇLAMA** "Xaçlamaq"dan *f.is.*

**XAÇLAMAQ** *f.* Xaç suyuna salma mərasimi icra etməklə xristian etmək. *Onların ata-anası və Nadya xala evdə yox idi .. təzə doğulan çağanı xaçlamaq mərasiminə getmişdilər.* Çexovdan.

**XAÇLI** *sif.* 1. Xaç taxmış, xaçı olan. *Xaçlı keşiş.*

2. *İs. mənasında*, *tar.* Səlib müharibələri iştirakçısı.

**XAÇNİŞAN** *is. tar.* Xaçlı (2-ci mənada) (səlib müharibələri iştirakçısı olan rıtsar paltarlarına tikilən xaç nişanına görə onlar belə adlanırdılar).

**XAÇPƏRƏST** *is.* Xristian. *İki-üç həftə bundan qabaq xaçpərəstlərin pasxa bayramı*

*idi.* C.Məmmədquluzadə. [Molla Sadıq:] *Xaçpərəstlərin islam milləti arasında təfriqə salmaq köhnə peşəsidir.* İ.Şıxlı.

**XAÇVARİ** *sif.* Xaç şəklində olan, xaçaoxşar, xaç kimi. *Xaçvari nişan. Xaçvari yol.*

**XAÇVARİLİK** *is.* Xaçvari şəkildə olan şeyin halı, görünüşü.

**XADİM** *is.* [*ər.*] 1. *köhn.* Xidmət edən, xidmətçi.

2. Hər hansı ictimai fəaliyyət sahəsində özünü göstərmiş, xidmətləri olan şəxs. *Elm xadimi. İctimai xadim. Siyasi xadim. – Ziyafətdə ölmüş xəlifə Müstərşidbillahın qızları, cariyələri, Bağdadın musiqi və incəsənət xadimləri və sairləri iştirak edirdi.* M.S.Ordubadi.

**XADİMƏ** *is.* Xidmətçi qadın, qulluqçu. *Müdir qadınla bir neçə xadimədən başqa* [monastırda] *kimsə qalmamış.* Çəmənzəminli. *Övrət nə demək? Xadiməmiz, cariyəmizdir!* M.Ə.Sabir.

**XADİMLİK** *is.* Xidmətçilik.

**XAH** [*fars.*] *klas.* İstər, istərsə. *Təfavüt eyləməz sənsiz mənə, ey sərvi-səngin-dil; Məkanın xah külxan, xah səhra, xah bağ olsun.* Qövsi. *Məqsədim şəşəəyi-mahi-camalındı sənin; Xah məsciddə onu, xah kəlisadə görüm.* S.Ə.Şirvani. *..Hər qisim dava və müharibələrdə xah siyasi olsun, xah iqtisadi və xah qeyri, qalib gələn tərəf müəllimlərin sayəsində nüsrət tapmışlar.* F.Köçərli.

**XAHİŞ** *is.* [*fars.*] Bir arzunu, ehtiyacı yerinə yetirmək üçün edilən müraciət, təmənna; rica, təvəqqe, istək. *Sizdən bir xahişim var. – ..Mən Qasımın xahişini əmələ gətirdim, yəni gedib oturdum onun yanında.* C.Məmmədquluzadə. *Bir ittifaq bu xahişi tezliklə əmələ gətirməyə səbəb oldu.* S.S.Axundov. // İstək, arzu, tələb. *Xahişin tərki-dilü can idi, mən həm etdim; Söylə, ey yar, görüm şimdi nə fərmanın var?* M.Ə.Sabir. [Xumar:] *Yoxsa bir xahişinmi var, Sənan? Hər nə qəlbində varsa eylə bəyan.* H.Cavid. *Mehriban Zeynalın bir çox xahiş və tələblərini qəbul edirdi.* S.Hüseyn. ☐ **Xahiş etmək (eləmək)** – rica etmək, təmənna etmək, təvəqqe etmək, istəmək. [Nüsrət Toğrula:] *Xahiş edirəm, sən mənim işlərimə qarışmayasan.* C.Cabbarlı. [Kamal:] *Onda xahiş eləyirəm, elə çağırın ki, anası bilməsin.* S.Rəhman.

**XAHİŞSİZ** *zərf* Xahiş edilmədən, öz razılığı ilə. *İndi gecə vaxtı Xanpərinin təklifsiz, xahişsiz Qəmərin evinə gəlməsi çox maraqlı idi.* Ə.Vəliyev.

**XAHNƏXAH(İ)** [*fars.*] *zərf* İstər-istəməz, laqeydcəsinə. *Qoca it xahnəxahi çıxmışdı qapıya və xahnəxahi öz vəzifəsini ifa edirdi.* C.Məmmədquluzadə. *Cəmilə xanım xahnəxahi çadrasını başına örtüb evdən çıxdı.* E.Sultanov. *Züleyxa* [Əsgərə ərə getməyə] *xahnəxah razı oldu.* C.Cabbarlı.

**XA-XA, XA-XA-XA** *nida.* Gülüş, qəhqəhə bildirmək üçün işlədilən təqlidi söz. [İskəndər:] *Allahın iti də mənim sözümə baxmır, nə qədər elədim, içəri girmədi. Xa-xa-xa* (*qah-qah çəkib gülür*). C.Məmmədquluzadə. *Xa-xa-xa!.. Məşədi Nemətqulu 10 min manat, Kərbəlayı Ağa Hacı 10 min manat, xa-xa-xa... necədir, Ağa Dərviş? Xa-xa-xa!..* N.Vəzirov. [Süleyman:] *Mən də elə bilirəm, bir qoyun şaqqası yeyiblər, xa-xa-xa!* Ə.Haqverdiyev.

**XAXAM** *is.* Yəhudilərdə baş kahin, ruhani başçısı. *Sən indi bu gün Gəncədə bir adlı xaxamsan!* Ə.Nəzmi.

**XAİN** *sif.* [*ər.*] 1. Vətəninə, xalqına xəyanət edən; satqın, xəyanətkar, dönük. [Pəhləvanlar:] *Dağ-daşından uçsun duman; Qara geysin xain insan!* A.Şaiq. *Bayquş xaraba, gecəquşu qaranlıq sevən kimi, xain adamlar da xəlvəti xoşlarlar.* M.İbrahimov. // *məc.* Etibarsız, vəfasız, aldadıcı, bel bağlanıla bilməyən. // İs. mənasında. [Dəmirqaya:] *Yəqin ki, aramızda olan xainlər* [casusa] *hər işimizi xəbər veriblər. Həmin xainlər tapılıb, cəzasına çatmalıdırlar.* H.Nəzərli. ☐ **Xain baxmaq** – 1) pis (xain) gözlə, pis niyyətlə baxmaq, təmiz ürəklə baxmamaq. [Güləndam:] *Yoldaş Qaradağlı, oğlumun sevgilisinə xain baxan o evli kişini tapın və cəzalandırın.* B.Bayramov; 2) bax **xain çıxmaq**. *Sancılsın tikanlar xain gözünə; Xain baxdın çün dostlara, danışma!* Aşıq Hüseyn. **Xain çıxmaq** – vətəninə, xalqına, dostuna, yaxınına xəyanət etmək, dönüklük göstərmək. [İblis İbn Yəminə:] *..Çəkəcəkdir başımız dürlü bəla; Çünki var başqa güna-*

*hın da sənin; Orduya, dövlətə çıxdın xain.* H.Cavid. *Xain çıxsa əgər bir qız, bir oğlan; Qurtarmaz ananın ahü-vayından*. Şəhriyar.

2. *məc.* Gördüyü yaxşılığa qarşı nankorluq edən; nankor, paxıl, qəlbiqara. *Çox xain adamdır.*

**XAİNANƏ** bax **xaincəsinə**. *Fərhad, o saatda bir gecə bağda keçirdiyi xainanə dəqiqələr yadına düşüb, cəld ayağa durdu.* C.Cabbarlı.

**XAİNCƏ(SİNƏ)** *zərf* Xain kimi, xainliklə, xəyanətlə. *Xaincə*(*sinə*) *hərəkət. Xaincəsinə basqın.* – [Səlimin] *rəftarı və hərəkəti nə Naşadın əlaqəsinə, nə də hər zaman gözlərini süzüb* [Mehribana] *baxmaqla ürəyinin arzusunu bildirən Novruzbəyin xaincə baxışlarına bənzəyirdi.* S.Hüseyn.

**XAİNLİK** *is.* 1. Xəyanət; xəyanət etmə, xəyanətkarlıq, dönüklük, satqınlıq, vəfasızlıq; xaincə hərəkət. *Xainlik etmək.*

2. Vəfasızlıq, əhdi pozma, dönük çıxma, dönüklük. [Süleyman:] *Mən də axtararam, özümə bir gözəl qız taparam, xainlik pis şeydir.* Ü.Hacıbəyov. *Dostlar arasında hey ola düzlük; Olmaya xainlik, həm ikiüzlük.* Aşıq Hüseyn.

3. *dan.* Paxıllıq, qəlbiqaralıq. □ **Xainliyini çəkmək** – paxıllıq eləmək, gözü götürməmək.

**XAK** *is.* [*fars.*] *klas.* Torpaq. *Kimin yolu düşsə xaki-dərinə; Ox vurar köksünə məlhəm yerinə.* Q.Zakir. *Kəsilib bir yana atılmışdır; Xakinə abi-qəm qatılmışdır.* A.Səhhət. *Dostun qədəmində bir ovuc xakam; Dost alsın canımı xoş sifətinən.* Aşıq Hüseyn.

◊ **Xak ilə yeksan olmaq** – bax **yerlə yeksan olmaq** ("**yer**"də). *Dünyada qalınca zində bir an sənsiz; Ey kaş, olam xak ilə yeksan sənsiz.* S.Ə.Şirvani. *Bir deyən olmadı, ey xanəxarab; Məmləkət xak ilə yeksan oldu!* M.Ə.Sabir.

**XAKAS** *is.* Türk xalqlarından birinin adı və həmin xalqa mənsub olan adam. *Xakaslar xristianlığı qəbul etsələr də, faktiki olaraq şamanizmə etiqad edirdilər.*

**XAKASCA** *sif.* və *zərf* Xakas dilində. *Xakasca dərslik. Xakasca-rusca lüğət. Xakasca danışmaq.*

**XAKİ** *sif.* [*fars.*] Bozumtul-yaşıl rəngli, torpaq rəngli. *Xaki pencək. Xaki* (*rəngli*) *frenç.* – *Sirat xaki köynək-şalvarda tərdən islanırdı.* Ə.Əbülhəsən.

**XAQAN** *is. tar.* Qədim türk və monqol hökmdarlarına verilən ad, titul. *Xəzər xaqanı.* – [Cəllad:] *Xaqan, ulu xaqan! Əfv et onu, ver qətlimə fərman!* H.Cavid. // *köhn.* Padşah, hökmdar, sultan. *Xaqanlar başına şeşpər çaldıran; Qulac qollar buran qoç Koroğludur.* "Koroğlu". *Neçə firon, neçə xaqan ölüb getdi bu dünyadan.* O.Sarıvəlli.

**XAQANLIQ** *is.* 1. Hökmdarlıq, padşahlıq. [Çopo:] *Okabayın bu hərəkətini xaqanlıq eşqinə düşməsi ilə mərbut görürlər.* Çəmənzəminli.

2. Xaqanın hökmü altında olan ölkə. *Xəzər xaqanlığı.*

**XAL** *is.* 1. Ya anadangəlmə, ya da sonradan dəri üzərində əmələ gələn xırda, dəyirmi ləkə. *Üzündə xal var. Qara xal.* – *Zəfərin yanında ucaboylu, çatma qaraqaşlı, sağ yanağında iri xalı olan bir gəlin vardı.* Ə.Vəliyev. [Qızın] *sağ yanağındakı xal üzünə xüsusi bir gözəllik verirdi.* Ə.Sadıq. □ **Xal kimi** – çox kiçik, bambalaca. *Ay bir xal kimi uzaqlarda dolaşır.* R.Rza. *O kimdir; Yüksəlir boşluqlarda; Görünür bir xal kimi.* M.Seyidzadə. *Bu nədir, Göygöldə kəpənək uçur; Sonsuz mavilikdə ağ bir xal kimi.* N.Xəzri.

2. Cürbəcür saplarla, rənglə vurulan naxış. *Xalının əlvan xalları. Gözəl xalları olan cecim.* – *Söylənir Şəkinin ipək malları; Quba xalçasının qara xalları.* S.Vurğun. □ **Xal vurmaq –** naxış salmaq. *Səltənət bu şəkillərə vurduğu hər ilmək, hər xal üstündə əsmişdi.* Mir Cəlal.

3. Qumar kağızının, zərin və s.-nin üstündəki nişanlardan hər biri.

4. İdman yarışlarında və oyunlarında qiymət qoyarkən hesablama vahidi. *Komanda gələn görüşləri yüksək səviyyədə keçirib, daha çox xal toplamağa çalışmışdır.* // Ümumiyyətlə, say, miqdar bildirir. *Bir xal artıq.* – [Cəbi:] *Getdikcə bir xal azaldardım.* S.S.Axundov. [Kərəmxan:] *Bu iki xalı eləbelə qəsdən uduzdum.* İ.Əfəndiyev.

5. Musiqinin əsas melodiyası ilə həmahəng olan yeni hissə, yeni cəhət. *Səsindəki məlahət və mahnının səmimi ahəngi* [Xəlilin] *bəzən yanlış vurduğu xalları duymağa qoymurdu.* M.Hüseyn. *Musiqidən az-çox başı çıxan adam radioda, adını eşitməsə belə, çalanın Qurban olduğunu dərhal təyin edər. Onun özünə məxsus üslubu vardır. Onun vurduğu rənglər, xallar, nida və intonasiyalar zəngin, incə və orijinaldır.* İ.Əfəndiyev.

◊ **Xal vurmaq** – fikrini, sözünü üstüörtülü şəkildə eyhamla, işarələrlə çatdırmaq. [Hümmət] *sözünü dəyişib zarafatyana bir xal vurdu.* B.Bayramov.

**XALA** *is.* 1. Ananın bacısı. [Sultan bəy:] *Xalanın muzdu o olar ki, canı rahat olar.* Ü.Hacıbəyov. *Budaq xalasının danışığını maraqla dinləyir, gözünü ondan çəkmirdi.* Ə.Vəliyev.

2. Qoca və ya yaşlı qadına müraciət edərkən, ya haqqında danışarkən hörmət əlaməti olaraq deyilir. *Sürmə xala lap qol zoruna Narıncı geyindirirdi.* S.Rəhman. *Ehtiyat xala dəmiryoldan xeyli uzaq .. səfalı yaylaq şəhərində yaşayırdı.* Mir Cəlal.

◊ **Xala xətrin qalmasın** – könülsüz, üreksiz, istəmədən görülən iş və ya deyilən söz haqqında. [Həmzə:] [Səriyyədən] *xala xətrin qalmasın, deyə soruşuruq, yoxsa ona kim qulaq asır.* C.Cabbarlı. [Vaqifin] *arvadı Qızxanım sabahdan bircə dəfə onun yanına gəlib, xala xətrin qalmasın deyə ərinin halını soruşub, yenə çəkilib getmişdi.* Çəmənzəminli.

**XALABACI** *is. mus.* Azərbaycan oyun havalarından birinin adı. *Bir qədər çalıb-oxuyandan sonra mütrüb kəmərçin* [qadın tumanı] *geyib, başına bir kəlağayı salıb xalabacı oynardı.* H.Sarabski.

**XALACAN** *is.* Xalaya nəvazişlə müraciət. *Xalacan, bir bizə gəlsənə!* – [Yunus xalasına:] *Bu nədir, xalacan, bircə baxsana!* Ə.Məmmədxanlı. // Yaşlı qadına mehribanlıqla, nəvazişlə müraciət. *Xalacan, bir az su verin, içim.*

**XALACIQ** bax **xalacan**. [Cəfər:] *Xalacıq, bu çox bahadır, qarpıza beş şahı vermək student cibinə yaraşmaz.* Çəmənzəminli.

**XALAGƏLİNİ** *is.* Ananın bacısının gəlini.

**XALA-XALA** *is.* Kiçik qızların gəlinciklə oynadıqları oyun adı; gəlin-gəlin.

**XALAQIZI** *is.* Ananın bacısı qızı.

**XALANƏVƏSİ** *is.* Ananın bacısı nəvəsi.

**XALAOĞLU** *is.* Ananın bacısı oğlu. – *Mən də Bakıya tərəf hazırlaşırdım, bizim xalaoğlu da yazmışdır.* S.Rəhimov.

**XALAT** *is.* [*ər.*] 1. Orta Asiya xalqlarının ətəkləri üst-üstə gələn, yaxası açıq üst geyimi. *Zolaqlı xalat. Özbək xalatı.*

2. Evdə və ya işdə geyilən, yaxası düymə və ya bağla bağlanan yüngül üst geyimi. *Həkim xalatı. Çit xalat.* – *Ağ xalat bürünər, zərnişan geyməz; Heç kəsi dindirib keyfinə dəyməz.* Aşıq Ələsgər. *Poladın arvadı Rəfiqə güllü xalatda otağa girib uşaqları dəhlizə qovdu, uşaqlar gülüşə-gülüşə bayıra qaçdılar.* M.Süleymanov. *..Pillələri* [Gülgəz] *endikcə xalatın ətəklərinin yellənib açıldığına fikir vermirdi.* İ.Hüseynov.

**XALATLIQ** *sif.* 1. Xalat tikilməyə yarar. *Xalatlıq parça.*

2. Xalat tikiləcək parçanın miqdarı (adətən saylarda). *İki xalatlıq parça.*

**XALÇA** *is.* Divara vurmaq və ya döşəməyə salmaq üçün müxtəlif rəngli yun və ya iplik saplardan toxunmuş naxışlı döşənəcək. *Butalı xalça. Xonçalı xalça.* – *Tut ağacının altında zərif kaşan xalçaları salınmış, mütəkkələr düzülmüşdü.* Çəmənzəminli. [Nabat] *eyvana xalça və döşək saldı.* İ.Əfəndiyev.

**XALÇAÇI** *is.* 1. Xalça toxuyan usta. *Qonşuluqda Şərif adlı bir xalçaçı usta var idi. Savadlı qızlardan xalça fabrikinə adam yığırdı.* Mir Cəlal. // Xalça mütəxəssisi.

2. *köhn.* Xalça ticarəti ilə məşğul olan adam, xalça taciri, xalça alverçisi. *Bakıda iri ticarətlə məşğul olan düyüçülər, xuşgəbarçılar, ipəkçilər, xalçaçılar, qara neftçilər də az deyildi.* H.Sarabski.

◊ **Xalçaçı rəssam** – Xalça eskizləri hazırlayan rəssam.

**XALÇAÇILIQ** *is.* Xalça toxuma sənəti; xalça toxuma işi (bir istehsal sahəsi kimi). *Xalçaçılıq sexi. Xalçaçılıq ustası.*

**XALÇA-PALAZ** *top.* Xalça və palazdan ibarət döşənəcək. *Ev xalça-palazla dolu idi. Otağa xalça-palaz döşəmək.* – [Molla Xatın]

*sübh tezdən tut ağacının altını sulayıb süpürdü, hovuzun başını göyçək xalça-palazla döşədi, samovar qoydu, çay dəmlədi.* E.Sultanov. [Səfər:] *Hələ qurtarmayıb vergi davası; Alıb altımızdan xalça-palazı.* S.Rüstəm. *Gülara suya çatdıqda xalça-palazı boşaltdı və yumağa başladı.* Ə.Vəliyev.

**XALÇAŞÜNAS** *is.* [xalça və *fars.* ...şünas] Xalçaçılıq işini yaxşı bilən adam, xalça mütəxəssisi.

**XALÇATOXUYAN** b a x **xalçaçı** 1-ci mənada.

**XALDAR** *sif.* [*fars.*] Xallı, xalı olan (əsasən heyvanlar haqqında). *Xaldar pələng.* – [Pəricahan xanım:] *Xaldar dayça mənim.* S.S.Axundov. *Keçəl Qulamqulu xaldar ilansayağı koldan-kola keçə-keçə oradan sürünüb, buradan çıxırdı.* S.Rəhimov. *Birdən xaldar tula irəli gedib geri qayıdır, zingildəməyə başlayır.* Ə.Vəliyev.

**XALDARLAMA** "Xaldarlamaq"dan *f.is.*

**XALDARLAMAQ** *f.* Xal-xal eləmək, xal salmaq, xallamaq. *Xamırı yeyən siçanlar bu şəkilləri də xaldarlamışdılar.* S.Rəhimov.

**XALDARLANMA** "Xaldarlanmaq"dan *f.is.*

**XALDARLANMAQ** *məch.* Xal-xal boyanmaq, xal-xal olmaq, xallarla örtülmək. *Bu ortada uzanan mizin üstü təsadüfən tökülən mürəkkəblərdən boyanıb xaldarlanmışdı.* S.Rəhimov.

**XALDLAR** *tar.* Van gölü həvalisində yaşamış və miladdan əvvəl XIV–XII əsrlərdə Urartu dövlətində hakimiyyət sürmüş tayfa.

**XAL-XAL** *sif.* Xallı, xallarla örtülü, xallarla bəzəkli, üstündə xallar olan. *Xal-xal parça. Xal-xal örpək. Xal-xal paltar. – Əlində qırmızı xal-xal çamadan; Gedir kənd yoluyla cavan bir oğlan.* B.Vahabzadə. □ **Xal-xal olmaq** – 1) parça-parça olmaq, tikə-tikə olmaq, parçalanmaq. *Vaza əlimdən düşüb xal-xal oldu. – Təzə ay göydə yandı; Ucu qıyqac dayandı; Buludlar oldu xal-xal.* M.Dilbazi; 2) üzərində xallar əmələ gəlmək, xallarla örtülmək, xal kimi olmaq. *Oğlanın solğun yanaqları qızarıb xal-xal oldu.* M.Hüseyn. *..Divarların suvağı xal-xal olmuş, yağışdan yuyulmuş kərpiclərin sarı samanı biz-biz çıxmışdı.* İ.Hüseynov. *Məmmədsadıq kösövləri yağışdan xal-xal olan ocağın qırağından tərpəndi.* B.Bayramov.

**XALXAL**[1] *is.* Keçmişdə qadınların yaraşıq üçün topuqlarına taxdıqları gümüş, qızıl və s.-dən düzəldilmiş zınqırovlu halqa. *Topuqlarını bəzəyən zümrüd xalxalların qızıldan düzəlmiş zəngləri xanım yeridikcə zərif-zərif səslənirdi.* M.S.Ordubadi.

**XALXAL**[2] *is.* Heyvanlara məxsus binalarda ayrıca bölmə. *Xalxalı təmiz saxlamalı.* – [Zərnigar xanım] *əlində çatı, buzov dalınca qaçanları da, malları xalxala dolduranları da .. gözdən qoymurdu.* İ.Şıxlı.

**XALI** *is.* Böyük xalça. *Azərbaycan xalıları. İran xalısı.* – [Hacı Qambay] *divardakı xalılara, rəfdəki qablara və bütün otaqdakı şeylərə ötəri göz gəzdirdi.* Qantəmir. [Nuriyyə] *qayğısız bir görünüş alaraq, qarşı divara vurulmuş xalıya baxdı.* İ.Əfəndiyev.

**XALIÇI** *is.* Xalı toxuyan usta, xalçatoxuyan.

**XALIÇILIQ** *is.* Xalı toxuma sənəti.

**XALI-XALÇA** *is. top.* Xalı və xalçalardan ibarət döşənək. *Otağa xalı-xalça döşəmək.*

**XALIYANI** b a x **kənarə** 3-cü mənada.

**XALİ** *sif.* [*ər.*] 1. Boş, adamsız, tənha. *O qədər çıxmadın, gördü aqibət; Sən gəzən yerləri xali gözlərim.* Q.Zakir. [Murad] *sakit, indiki insanlardan tamamilə xali bir yer arayırdı.* S.Hüseyn. *Aslan xali küçədə çox gözləmədi.* M.Hüseyn.

2. Sahibsiz, yiyəsiz, tutulmamış, boş. [Qoca:] *Yazasan qonşumuzdakı xali yerdən bir az kəsib bizə versinlər.* Ə.Haqverdiyev. [Hacıkərim] *gündən-günə böyüməkdə və zənginləşməkdə olan şəhərin ən gurultulu küçələrində ucuz qiymətə evlər və xali yerlər aldı.* A.Şaiq. *O zaman ayrılanda nə təhər oldusa, Durmuş xali yer yiyəsi oldu.* Mir Cəlal. □ **...xali qalmaq** – xəbərsiz olmaq, xəbəri olmamaq. *Mədəniyyətdən xali qalıb. – ..Heyfa ki o Cavanşir elm və mərifətdən xali qalıbdır.* F.Köçərli. **Xali olmaq** – boş olmaq, tutulmamaq. **Xali olmamaq** – uzaq olmamaq, canı qurtarmamaq. [Vəzir:] *Hər vaxt ki mən bu xaraba olmuş otağa gəlləm, heç bir xətadan xali olmanam.* M.F.Axundzadə.

◊ **Meydan xali qaldı** – meydan boş qaldı, hamı yox olub getdi. [Kərbəlayı Rəcəb:] *Dedim Zinət xanım, Balaqardaş və Rzaqulu namünasib cavanlar idi, hər ikisi badi-fənaya getdilər, meydan qaldı xali.* N.Vəzirov.

**XALİQ** *is.* [*ər.*] Xəlq edən, yaradan (Allahın adlarından biri). *Yaxşılıq et, at dəryaya, balıq bilməsə də, xaliq bilər.* (Ata. sözü). *Ol gün ki sənə xaliq edər lütf bir övlad; Olsun ürəyin şad.* M.Ə.Sabir. [Molla Qurban Fərruxa:] *Bir olan xaliq səni və bütün külfətini yerin-göyün bəlasından hifz eləsin.* Ə.Vəliyev.

**XALİS** *sif.* [*fars.*] 1. Heç bir qatışığı olmayan, saxta olmayan; saf, təmiz. *Xalis gümüş. Xalis yun. Xalis spirt.* – [Hacı Qara:] *Əgər nəqd pulunuz yox isə, mən yağ ilə sövda edərəm, bəşərti ki xalis inək yağı ola.* M.F.Axundzadə. [Hurizad] *xalis xına tapmadığı üçün başını* “*türkəsayaq*” *davalarla boyar*(*dı*)*.* Çəmənzəminli. [Oğlan:] *Biz bu daş-qaşı xalis qızıla satırıq, bəy!* S.Rəhimov. // Düzgün, təmiz. [Oğlan] *gülə-gülə və oranın yerli şivəsinə uyğun, xalis və təmiz bir Azərbaycan dilində mənə cavab verdi.* M.Rzaquluzadə.

2. Əsil, həqiqi. ..[Mirzə] *başının tüklərini pırtlaşdırıb özünə bir laübalı sifət verib aynaya baxdı və dedi: – Afərin, Səfər, indi xalis şairsən!* Ə.Haqverdiyev.

3. *məc.* Məsum, ismətli, bakir, təmiz. *Qardaşlar qızı yuxarı çəkib gördülər ki, bu qız deyil, xalis mələkdir.* (Nağıl).

4. *məc.* Səmimi, doğru, saf. *Qızxanım xala dəxi səbəti boşaldıb verdi və üzünü qibləyə, əllərini göyə tutub, xalis ürəklə onlara dua etdi.* “Məktəb”.

**XALİSLİK** *is.* Qatışıqsızlıq, saflıq, təmizlik; xalis şeyin halı, keyfiyyəti.

**XALQ** *is.* 1. Ölkənin, dövlətin sakinləri, əhalisi. *Azərbaycan xalqı.* – *Əsl qəhrəmandır; Əsl şair ki; Ömrü də xalqının ömrüylə birdir.* N.Xəzri.

2. Millət. *Qəm-kədər ordusunun bayrağını parçaladım; Xalqımın ömrünə öz ömrümü candan caladım.* S.Rüstəm. *Alnındakı qırışlar adicə qırış deyil; Öz xalqının keçdiyi iztirab yollarıdır!* B.Vahabzadə.

3. Eyni yerdə yaşayan adamlar, camaat. *Dağ xalqı. Aran xalqı. Köçəri xalq.* – *İndi Əşrəf .. ailə xalqı üçün daha qiymətli idi.* A.Şaiq. [Turxan bəy Bəypolada:] *Çingiz bəy Dağıstan xalqına qarşı başqa hörmət, başqa bir məhəbbət bəslər.* H.Cavid. [Yazgül Şeydaya:] *Gərək bu ilin məhsulu haqqında Göytəpə xalqının rəyini biləm!* Ə.Məmmədxanlı. // Ümumiyyətlə, camaat, kütlə, el, adamlar. *Vaqiflə Mirzə Əliməmməd xalqa təzim edə-edə yuxarı başa keçib, göstərilən yerdə əyləşdilər.* Çəmənzəminli.

4. Ölkənin (istismarçı dövlətlərdə) əsas, əməkçi kütləsi. *Zəhmətkeş xalq. Xalqın mənafeyi uğrunda mübarizə aparmaq.*

5. Xalqa, ölkəyə aid olan, xalqa, ölkəyə mənsub olan. *Xalq gəliri. Xalq sərvəti.* [İmran kişi:] *..Xalq malına kəc baxanın gözlərindən qan damar.* M.Hüseyn. // Xalqla bağlı olan, xalq tərəfindən yaradılmış, xalqın dünyagörüşü, ruhu ilə sıx bağlı olan. *Xalq ədəbiyyatı. Xalq yaradıcılığı. Xalq sənəti.* – [Usta] *Azərbaycan xalq mahnılarını çox sevirdi.* M.Hüseyn. *Qəhrəman dəryazçı ilə görüşüb aralandı və xalq hakimiyyətinin müdrik mənasını təqdir etdi.* S.Rəhimov. [Səlimin] *yadına adicə bir xalq lətifəsi haradansa gəlib düşmüşdü.* B.Bayramov. // Bəzi idarələrin və vəzifəli şəxs adlarının tərkibində işlənir. *Xalq məhkəməsi. Xalq elçisi. Xalq komissarlığı.* // Hökumət tərəfindən elm, incəsənət və s. sahəsində böyük xidmət və fəaliyyətə görə verilən fəxri adların tərkibində işlənir. *Xalq artisti. Respublikanın xalq rəssamı.*

**XALQÇI** *is. tar.* Xalqçılıq tərəfdarı.

**XALQÇILIQ** *is. tar.* XIX əsrin ikinci yarısında Rusiyada xırda burjua ziyalılarının, kəndli icmasını idealizə və fəhlə sinfinin rəhbərlik rolunu inkar edən ictimai-siyasi hərəkatı.

**XALQŞÜNAS** *köhn.* b a x **etnoqraf**.

**XALQŞÜNASLIQ** *köhn.* b a x **etnoqrafiya**.

**XALLAMA** “Xallamaq”dan *f.is.*

**XALLAMAQ** *f.* Xal qoymaq. *Üzünü xallamaq.*

**XALLANMA** “Xallanmaq”dan *f.is.*

**XALLANMAQ** *məch.* 1. Xal qoyulmaq.

2. Xal-xal olmaq, xallar əmələ gəlmək. *İstidən üzü xallandı.*

**XALLI** *sif.* 1. Üzündə xalı olan. *İki övlad anası, xallı .. xanım vaxtilə demişdi ki, siz Cəmilə xanım, bizim sənətkarı dərk edin.* S.Rəhimov. *Nərminə göyçək idi. Qara xallı, girdə çəhrayı sifətindən təbəssüm əskik olmazdı.* B.Bayramov.

2. Bəzi zooloji adların tərkib hissəsi. *Xallı böcək. Xallı pələng. – Gah xışıldardı xallı, parlaq ilan; O qara daşların arasından.* A.Səhhət. *Burada çiçək-çiçəyə qarışır, böcəklər burunlarını göstərir, ağlı-qırmızılı, xallı kəpənəklər uçuşurdular.* S.Rəhimov.

**XALLICA** *sif. oxş.* İncə xalları olan, xallı, xal-xal. *Qaraca qız* [pişiyə] *yaxınlaşıb gördü ki, xallıca gözəl bir pişik balasıdır.* S.S.Axundov.

**XALLILIQ** *is.* Üzündə çoxlu xal olma.

**XALSEDÓN** [*yun.*] Kvars növündən mineral. *Nazik laylı xalsedon əqiq adlanır.*

**XALTA** *is.* Heyvanların (əsasən itin) boynuna keçirilən qayış; boyun halqası. *Axırda ayı dartınıb xaltanı başından çıxartdı və ildırım kimi özünü Yusifin üstünə atdı.* S.S.Axundov. *Atı qolbənd eləyən Sarı İmaməli xaldar tulanın xaltasından bərk-bərk yapışmışdı.* S.Rəhimov.

◊ **Başına (boynuna) xalta salmaq (keçirmək)** – 1) özünə tabe etmək, öz itaəti altına almaq. *Keçirdik öz əlimizlə; Boynumuzu biz xaltaya; Sap olmadıq bir baltaya.* B.Vahabzadə; 2) tez, vaxtından əvvəl evlənən adama zarafatla söylənən ifadə. *Nə tez başına xalta saldın?* – [Xəlil Pərvizə:] *Hamı sənin kimi başına vaxtsız xalta salmaz ki...* Çəmənzəminli.

**XALTALAMA** "Xaltalamaq"dan *f.is.*

**XALTALAMAQ** *f.* 1. Boynuna xalta keçirmək. *İtin boynunu xaltalamaq.*

2. *məc.* Özünə tabe etmək, öz itaətində saxlamaq. [Nurcahan:] *Mən də Nurcahanam, sənin kimiləri çox xaltalamışam, ay it!* N.Vəzirov.

**XALTALI** *sif.* Boynunda xalta olan. *Xaltalı it.*

**XALTURA** [*rus.*] 1. Əsas, adi qazancdan başqa asan və əyri yolla əldə edilən əlavə qazanc. *Xaltura ilə məşğul olmaq.* ☐ **Xaltura etmək** – xaltura ilə pul qazanmaq.

2. Başdansovma, atüstü, yarıtmaz görülmüş iş. *Oxuyan hazırlıqsız oxuyur, çox vaxt səsini tarla uzlaşdıra bilmir, xaric oxuyur, yaxud çaşır, ümumiyyətlə, xaltura əmələ gəlir.* Ü.Hacıbəyov.

**XALTURAÇI** *is.* 1. Başdansovma, atüstü iş görən, xaltura edən adam.

2. Xaltura yolu ilə pul qazanan adam.

**XALTURAÇILIQ** *is.* 1. Xaltura ilə məşğul olma, xaltura yolu ilə pul qazanma.

2. Başdansovma və bacarıqsız görülən iş.

**XALVAR** *is.* 1. Azərbaycanın müxtəlif yerlərində müxtəlif ağırlıqda (təxminən 400 kq ağırlığında) olan köhnə çəki ölçüsü. *Hesab var dinarla, bəxşiş var xalvarla.* (Ata. sözü). [Hacı Mehdi:] *Demək ki, bugünkü qiymət, xalvarı 25 tümən?* M.S.Ordubadi. [Cavad:] *O günləri Məşədi Babanın qızının kəbini kəsiləndə iki xalvar buğda, .. bir kəllə qənd və bir girvənkə çay gətirmişdilər.* B.Talıblı.

2. *məh.* Bir xalvar toxum əkiləcək qədər sahə. *Zeynəb Heydərə gələndən üç il sonra Kərbəlayı İsmayıl vəfat edib .. və iki xalvar zəmi qoyub getdi.* C.Məmmədquluzadə.

◊ **Bir xalvar** – çoxlu, külli miqdarda. [Hikmət İsfahani:] *..Mən axı o ruznaməyə hər ay bir xalvar pul xərcləyirəm.* M.İbrahimov. [Maral:] *Sizdən də Kayana bir xalvar salam-dua aparıram.* Ə.Əbülhəsən.

**XAM** *sif.* 1. Ələ öyrənməmiş, əhliləşməmiş. *Xam quş. – ..Həmişə də qiymətli xam atı alıram ki, onu qoşquya öyrədim.* C.Məmmədquluzadə. [Sərvinaz:] *Xam döngə kimi havalanıb çıxıblar dağ döşünə, .. bu əl boyda tifil bunların gözünə tikan kimi batır.* B.Bayramov.

2. Əkilməmiş, əkinə düşməmiş, şumlanmamış, sürülməmiş, işlənməmiş, əl dəyməmiş. [Muxtar kişi Adiləyə:] *Eşidirsən təpənin dalından gələn o gur səsi? Təzə aldığımız traktordur, güney talada xam torpağı sökür.* Ə.Məmmədxanlı. // Eyni mənada otlaq, çəmən və s. *Xam örüş.* – [Ramazan Sahib müəllimə:] *Qərəz, uzun sözün qısası, bəylər xamda otlayan buğa kimi tutuşdular.* M.İbrahimov. *Mal-qara xam otluğa dağılıb şırthaşırt otlayırdı.* M.Hüseyn.

3. Öz təbii halında olan, əridilməmiş. *Xam piy. Xam quyruq. – ..Uzaqdan-uzağa xam gümüş kimi; Ağaran səhradan necə əl çəkim?* M.Müşfiq.

4. Aşıya qoyulmamış, aşılanmamış, işlənməmiş. *Xam dəri. – Bu alçaq binaların damlarında .. xam və yarımxam keçi, qoyun dərilərinə rast gəlmək olardı.* P.Makulu.

5. Çiy, bişməmiş. *Xam ət. Xam kərpic.*

6. *dan.* Dəyməmiş, yetişməmiş, kal. *Xam meyvə. – Çıxma ərik ağacına bihudə, dilbərim; Yen gəl aşağı, nə yetkini var, nə xami var.* M.Möcüz.

7. *məc.* Yetkin olmayan, təcrübəsiz, püxtələşməmiş, hazırlıqsız, vərdişsiz. [Şəkinski:] *Mən xam bir aktrisanı səhnəyə buraxa bilmərəm.* C.Cabbarlı. [Əsgər] *gah bazarın bu başında, gah o başında xam müştəri axtarır ki, saqqalını qırxıb, cibini kəssin.* B.Talıblı. // İs. mənasında. *Xamın gözü böyük olar.* (Ata. sözü). [Qəmər:] *Sən hələ xamsan, püxtə olmağa çox səfər gərək...* S.S.Axundov.

◊ **Xam düşmək** – bir işin nəticəsini əvvəlcədən düşünmədiyi, lazımınca dərk etmədiyi üçün yanılmaq, səhv iş görmək. *Mən özüm də əvvəl xam düşdüm və keçən il getdim Bakıya, 5 manat verdim, qəbz aldım...* C.Məmmədquluzadə. **Xam ələ salmaq, xam salmaq** – qarşısındakını xam, təcrübəsiz, bacarıqsız, anlaqsız, xəbərsiz sayaraq, bundan istifadə etməyə çalışmaq. *Cəfər paşa istəyirdi ki, onu xam salsın.* "Koroğlu". [Məmişov:] *Ay şeytana papış tikən Manaf, sən də məni xam ələ salıb dindirmə, danışmayacağam.* M.İbrahimov. **Xam xəyal** – həyata keçirilə bilməyən, bir xəyal olaraq qalan, mümkün olmayan iş, arzu, məsələ; boş xəyal. [Kərimov Aydına:] *Sən xam xəyallarınla mənim başımı doldurma.* H.Seyidbəyli. **Xam xəyal eləmək (olmaq)** – yanlış xəyala düşmək, səhv fikirdə olmaq. [Zalxa:] *Tarverdi bir zad gətirəcəkdirmi ki, yarısın sənə verə? Sən niyə belə xamxəyal olursan?* M.F.Axundzadə. [Növbərlilər:] *Keçən il Surxab məhəlləsinin dəstəsinə zor gəlmişdiniz, olmaya xam xəyal olubsunuz.* P.Makulu. **Xam tovlamaq** – b a x **xam ələ salmaq**. *Bizdən gözünü yığ ki, sənə aldanan olmaz; Get onları xam tovla ki, təzvir eləyirsən?* M.Ə.Sabir. [Alı Səfi bəyə:] *Bizi xam tovlamışdın, il uzunu işlədib bir qəpik də vermirdin.. Daha indi bəy-zad dəbdən düşdü..* Çəmənzəminli.

**XAMA** *is.* Çiy südün üzü, qaymağı, smetan. *Həmayıl durub camışın xamasını, beçənin balını, buğdanın çörəyini gətirib qoydu Ələsgərin qabağına.* "Aşıq Ələsgər".

**XAMAÇI** *is.* Xama hazırlayan adam.

**XAM-XAM** 1. *sif.* Bişməmiş, çiy-çiy, xam halda. *Əti xam-xam yemək.*

2. *zərf* Avam adam kimi. *Nə xam-xam danışırsan.* – [Dəvəçi] *xam-xam bağırmağa başladı.* S.Vəliyev.

**XAMIT** *is.* Qoşqu heyvanlarının boynuna keçirilən üstü yumşaq boyunduruq. *Qoca .. atların xamıtını düzəltmək bəhanəsilə yerə düşüb arabanın qabağında bir xeyli qurdalandı.* M.Hüseyn.

**XAMITQIÇ** *sif. dan.* Ayaqları (qıçları) əyri, əyriqıç, xamıtpaça. *Qızın anadangəlmə qüsuru var idi – qılçaları əyri idi* (*el arasında belələrinə xamıtqıç deyirlər*). S.Dağlı.

**XAMITLAMA** "Xamıtlamaq"dan *f.is.*

**XAMITLAMAQ** *f.* Boynuna xamıt keçirmək.

**XAMITLANMA** "Xamıtlanmaq"dan *f.is.*

**XAMITLANMAQ** *məch.* Boynuna xamıt keçirilmək.

**XAMITLI** *sif.* Boynuna xamıt keçirilmiş. *Xamıtlı at.*

**XAMLAMA** "Xamlamaq"dan *f.is.*

**XAMLAMAQ** *f.* 1. Uzun müddət məşğul olmadığı üçün yaddan çıxarmaq, yadırğamaq, unutmaq. [Qədir:] *Haçandan minik görmədiyi üçün xamlayacağını yəqin etmişdi.* Mir Cəlal.

2. *məc.* Xam hesab edərək aldatmağa çalışmaq, xam tapmaq. [Əmrulla Gülsabaha:] [Ötgün] *də sizi xamlayıbdır, siz də hələ deyirsiniz ki, belə.* C.Cabbarlı.

**XAMLAŞMA** "Xamlaşmaq"dan *f.is.*

**XAMLAŞMAQ** b a x **xamlamaq** 1-ci mənada.

**XAMLIQ** *is.* 1. İşə yaxşı bələd olmama; təcrübəsizlik, naşılıq, nabələdlik. *Planların alt-üst olmasına səbəb Kəşaninin* [qanmazlığı] *və xamlığı olmuşdu.* Qantəmir. *Kürd*

*Əhməd onun ticarət işlərindəki xamlığına güldü.* M.İbrahimov.

**XAMMAL** *is.* Sonradan sənayedə müxtəlif şeylər emal edilmək üçün yerdən çıxarılan və ya istehsal edilən material. *Sənaye üçün xammal. – Tədqiqat nəticəsində aşkar edilmişdir ki, Azərbaycan öz zəngin mədən ehtiyatları ilə mədən sənayesinin ən mühüm xammal mənbəyidir.* M.Qaşqay. // *məc. Amerikaya ağıl axır, beyin axır; .. Beyinləri xammal kimi daşıyırlar; Qalaq-qalaq.* B.Vahabzadə.

**XAMNA** *is.* Xam, işlənməmiş ipək.

**XAMUŞ** *zərf* [*fars.*] Dinməz, susmuş, sakit (halda). *Xamuş dayanmaq. Xamuş olmaq. – Nadir daxil oldu, qeybət kəsildi, hamısı xamuş oturub çay içməyə məşğul oldu.* B.Talıblı. // Əmr şəklində: xamuş! – sus! dinmə! sakit! səssiz! *Mən böylə kəlamə dutmazam guş; Leyli sözü söylə, yoxsa xamuş!* Füzuli. [Şah qəzəblə:] *Xamuş! Artıq söz lazım deyildir.* Ü.Hacıbəyov. ☐ **Xamuş eləmək (etmək)** – 1) susdurmaq. *Mədhi-güldən bülbüli gülşəndə xamuş eylədim.* S.Ə.Şirvani; 2) *məc.* keçirmək, söndürmək. *Kəsdim öz əlimlə öz ayağım; Xamuş elədim mən öz çırağım.* M.Ə.Sabir. **Xamuş olmaq** – 1) susmaq, səsini kəsmək, dinməmək, sakit olmaq. [Cəfərqulu xan:] *Camaat, xamuş olun, Ağa Məhəmməd xan söz demək istəyir.* Ə.Haqverdiyev; 2) *məc.* keçmək, sönmək. *Gah olur xamuş, gahi odlanır yerdən çıraq.* Qövsi.

**XAMUŞAN** *klas.* bax **xamuşluq**. *Dərə, təpə sakitlikdir, xamuşan; Yoxdur kənd içində bir nəfər insan.* A.Səhhət.

**XAMUŞANLIQ** *köhn.* bax **xamuşluq**. *Ətraf tamam xamuşanlıq idi.* S.M.Qənizadə.

**XAMUŞLUQ** *is.* Sakitlik, sükut, səssizlik. *Gecə ortasından aşmışdı və yayın isti xamuşluğunu pozan ancaq minarədən gələn minacat səsi idi.* B.Talıblı. *Səfərqabağı ailədə olan bu ani xamuşluq içərisində bu barədə hər kəs bir cürə düşünürdü.* S.Rəhimov.

**XAN** *is. tar.* 1. Orta əsrlərdə Şərq ölkələrinin bir çoxunda feodal hakimlərin titulu və bu titulu daşıyan şəxs. *Bir əkinçi gedirdi məstanə; Yolda ol rast gəldi bir xanə.* S.Ə.Şirvani. *19-cu ilin yayında Naxçıvan xanlarının cavanları Keçiliyə ova gəlmişdilər.* E.Sultanov. *Müxtəlif yerlərdən ruhanilərin, mülkədarların, bəy və xanların "Əkinçi"yə hücumu artıb şiddət edirdi.* M.İbrahimov. // Bu zümrəyə mənsub adamların adına əlavə edilən ləqəb. *Alı kişi neçə illər idi ki, Həsən xana ilxı otarırdı.* "Koroğlu". *Almış sifarişi Hüseynqulu xan; İldırım tökülür qaş-qabağından.* S.Vurğun.

2. *məc.* Ağa, hökmran. *Necə ki yar ilə həmzəban idim; Xalq içində sultan idim, xan idim.* Q.Zakir.

3. *köhn.* Aşıq-aşıq oyununda: başçı, hakim. *Bu oyunda iştirak edənlər öz aralarında birini "xan" seçərdilər.* H.Sarabski. *Əvvəllər kənd uşaqları, "xan cığal olar" – deyə* [Məmmədxanla] *oynamaq istəməsələr də, sonralar razılıq vermişdilər.* P.Makulu.

4. *məc.* Obrazlı təşbehlərdə: canalıcı, işvəli, nazlı gözlərə işarə. *Müddətdi həsrətəm, bir gəz bəri bax; O xan gözlərinin sədəqəsi canım.* Q.Zakir.

5. Bəzi mürəkkəb kişi adlarının ikinci tərkib hissəsi; məs.: Muradxan, İsmixan, Səlimxan.

◊ **Xan ilə aş (plov) yemir ki, bığı yağa batar** – çox məğrur, lovğa, təkəbbürlü adam haqqında. [Sultan bəy:] *Əşi, xan ilə aş yemirəm ki, bığım yağa batar..* Ü.Hacıbəyov.

**XANA** *is.* 1. Xırda dördbucaqlara bölünmüş bir şeyin qisimlərindən hər biri; dama, kvadrat, göz, bölgü. *Şahmat taxtasının xanaları. –* [Davud] *dəftər qoyub cızıqladı, xanalar ayırdı: "Sıra, nömrə, familiyası, aldığı şey, neçə dənə, imza".* Mir Cəlal.

2. Bax **hana**[1]. *Qadınlardan kimisi yun darayır, ip əyirir, kimisi xana qurub kilim toxuyurdu.* A.Şaiq. ..[Xeyrənisə] *istirahət və yuxusunu özünə haram edib lampa işığında yun darayır, ip əyirir, xana toxuyurdu.* S.Hüseyn.

3. Başqa isimlərə qoşularaq mürəkkəb isimlər əmələ gətirir; məs.: kitabxana, qiraətxana, hamamxana, camaşırxana, duşxana və s.

**XANA-XANA** *sif.* 1. Xanalardan ibarət, xana şəklində; xanalı; dama-dama. *Xana-xana dəftər.*

2. Göz-göz, otaqlardan ibarət. *Əzizim, xana-xana; Evləri xana-xana; Əlim bəndivan olub; Zər baftalı yaxana.* (Bayatı).

**XANALI** *sif.* Xanası olan, xanalara bölünmüş, xana-xana. *64 xanalı dama taxtası.*

**XANÇOBANI** *is.* İti oynanılan Azərbaycan xalq rəqsi və bu rəqsin havası.

**XANDOSTU** *is. dan.* Dayı, əmi və başqa qohumların arvadlarına hörmət üçün verilən ad. *Xandostu, amandı, qoyma gəldi! Didarı yamandı, qoyma gəldi!* M.Ə.Sabir. *Anlar nə ata, nə ana, həmsayə bizim qız! Xandostu! Düşübdür yeni sövdayə bizim qız!* Ə.Nəzmi.

**XANƏ** *is.* [*fars.*] 1. Ev, məskən. *..Rəşid Abxazlı yedəyində kəhər at dar və qorxulu cığırla dağ başına, öz xanəsinə tərəf dırmaşırdı.* F.Köçərli. [Qurban Fərruxa:] *Bir uşaq göndərib bu qəfil gülləni öz xanəmdə, əhli-əyalımın yanında da sinəmə vura bilərdin.* Ə.Vəliyev.

2. *mus.* b a x **takt**. *Musiqi əsərlərindəki ağır və yüngül səslərin ardıcıl və müntəzəm surətdə təkrar edilməsi musiqinin bərabər ölçülü ayrı-ayrı taktlara* (*xanələrə*) *bölünməsini əmələ gətirir.* Ə.Bədəlbəyli. *..Sədəf bu dəfə də mülayim və mehriban bir səslə şagirdinin səhvlərini göstərir, o istədiyi kimi çalmayınca yeni xanəyə keçmirdi.* M.Hüseyn.

**XANƏDAN** *is.* [*fars.*] 1. Qohumluq, ya vərəsəlik hüququna əsasən taxtda ardıcıl surətdə bir-birini əvəz edən hökmdarlar sülaləsi. [Qətibə:] *O ancaq məni məhv etdi, mənsə bütün Eldəniz xanədanını məhv edəcəyəm.* M.S.Ordubadi. [Qazı Turxan bəyə:] *Atadan-babadan sizin namuslu, heysiyyətli bir xanədan olduğunuzu bütün vilayət bilir..* H.Cavid. *Fərmanın həqşünas baxışı Mir Haşıma dikildi. Bu baxışı ilə o, sanki ağanın Qacar xanədanına və səltənət məqaminə etdiyi bu yaxşılığın hədər yerə getməyəcəyini anlatmaq istəyirdi.* P.Makulu.

2. *məc.* Bir yerdə yaşayan böyük ailə, nəsil; xaniman. [Pəricahan xanım:] *Xanədanımızda ən müti, ən fədakar sayılan Hadi lələ də yox olmuşdur.* S.S.Axundov. *Artıq bu xanədanın dağılacağını bildirən zəlzələnin əlamətləri hiss edilməkdədir.* M.İbrahimov.

**XANƏDANLIQ** *is. tar.* Böyük bir sülaləyə mənsubiyyət.

**XANƏGAH** *is.* [*fars.*] Bir şeyx və ya mürşidin rəyasəti altında olan dərvişlərin yaşadıqları və ibadət etdikləri yer; təkyə, ibadətgah.

**XANƏXƏRAB** *sif.* [*fars.*] *klas.* Bədbəxt, zavallı, yazıq, evi yıxılmış (adətən təəssüf, mərhəmət məqamında işlənir). *Düşdü əlimə bir gecə bir şişə şərab; Gətdim evə, sübh içim məni-xanəxərab.* S.Ə.Şirvani. *Ər deyil, şair imiş xanəxərab; Fikri yazmaq, oxumaq, şüğlü kitab.* M.Ə.Sabir. *Bu xanəxərab* [arvad] *neçə yaşındadır məyər?* N.Vəzirov. ☐ **Xanəxərab etmək** – bədbəxt etmək, evini yıxmaq. *Yox, yox, başına dönüm, a molla, məni xanəxərab edərsən.* C.Məmmədquluzadə.

**XANƏNDƏ** *is.* [*fars.*] Toylarda, məclislərdə, konsertlərdə və s.-də oxuyan peşəkar müğənni. *Bir tərəfdə tarzən və xanəndə oturub, musiqi çalınır.* Ü.Hacıbəyov. *Qızışan xanəndə qavalını hərləyir, tarçı tarını kökləyir, kamançaçı simləri düzəldir, nəğməney səsi göy qayalardan əks-səda verirdi.* S.Rəhimov. *..Qarabağ şikəstəsi deyən cavan xanəndənin mahnısı dəniz üzərindən yüksələrək, ta uzaqlara qədər işləyirdi.* M.Hüseyn.

**XANƏNDƏLİK** *is.* Xanəndə sənəti, müğənnilik. *Musiqi məktəbinin xanəndəlik sinfi. – Xanəndəliyin hörməti var, yaxşı sənətdir; Xalqa, səni bil, sevdirən ancaq bu cəhətdir.* Ə.Vahid. ☐ **Xanəndəlik eləmək** – bir peşə kimi toylarda, məclislərdə, konsertlərdə və s.-də oxumaq, müğənnilik etmək. *Məşhur mərhum xanəndə Hacı Hüsü də Məkkədən gələndən sonra əlinə qaval alıb xanəndəlik eyləyirdi.* Ə.Haqverdiyev.

**XANƏNİŞİN** *sif.* [*fars.*] Evdən bayıra çıxmayan, gününü evdə keçirən, daim evdə olan, adamlar arasına çıxmayan. *Xanənişin adam.* ☐ **Xanənişin etmək** – birinə cəza olaraq evdən kənara çıxmağa, cəmiyyətə qarışmağa icazə verməmək, yaxud hər hansı bir səbəbə görə camaat arasına, evdən bayıra çıxa bilməməsinə səbəb olmaq. [Qətibə xatun Səba xanıma:] [Qızıl Arslan] *qazıları, ruhaniləri, əyanları və vəzirləri həbsə alır, sürgünə göndərir, xəlifə tərəfindən təsdiq edilən padşahı xanənişin edir*(*di*). M.S.Ordubadi. **Xanənişin olmaq** – hər hansı bir səbəbə görə gününü evdə keçirmək, evdən bayıra çıxa bilməmək, xarici aləmlə əlaqəni kəsmək. [Gülsümün] *atası*

*da o qədər qocaldı ki, daha gözləri qüvvətdən düşüb, başmaq tikməyə qadir olmayıb xanənişin oldu.* Ə.Haqverdiyev. *Xanənişin olmuş* (f.sif.) *Molla Qasım bir dəfə bir yığıncağa getmişdi.* S.S.Axundov.

**XANGƏLDİ** *is. dan.* Uzun intizardan sonra gəlib çıxan adam haqqında zarafatla deyilən söz. *Sənin gəlməyin lap xangəldiyə döndü.*

**XANI, XANIBALIĞI** *is. zool.* Şirin sularda yaşayan qara zolaqlı, qırmızıya çalar alt üzgəcli balıq.

**XANIKİMİLƏR** *is. zool.* Xanı tipli balıqlar sinfi.

**XANIM** *is.* 1. Hörmət və şərəf üçün qadınlara verilən ad; bəyim. [Murad:] *Ah, xanım, bir sənsən mənim pənahım; Mən qərib kimsəyəm, yox bir günahım.* H.Cavid. *Dəlilər, xanımlar Koroğludan çox nigaran idilər.* "Koroğlu". *Çərşənbə günündə çeşmə başında; Gözüm bir alagöz xanıma düşdü.* Aşıq Ələsgər. // Tanış olmayan qadına hörmətlə müraciət. *Xanım, məni dinləyin.* // Hörmət üçün qadın adlarına əlavə edilir. *Nizami, Məhsəti xanıma ürək və təsəlli vermək üçün uzun-uzadı danışdı.* M.S.Ordubadi. *Ağa Murad bəyin Reyhan xanımla rəftarı .. get-gedə sərtləşirdi.* T.Ş.Simurq. [Şeyda Kəngərli:] *Davamlı olun, Sənubər xanım, lazımlı fikri həyata keçirmək çətin olduğu kimi, həm də şərəflidir.* B.Bayramov. // Qadınlığın bütün gözəl sifətlərini özündə cəmləşdirən qadın haqqında; alicənab, nəcib. *Çox xanım adamdır* (bu mənada xanım-xatın şəklində də işlənir).

2. Qadın, arvad, zövcə. *Yoldaşım öz xanımı ilə gəlmişdi. – Bu vaxt evin xanımı uzun, yekə məcməyidə buğlanan plovu gətirib, stolun üstünə qoydu.* M.Hüseyn.

3. Bəzi mürəkkəb qadın adlarının ikinci tərkib hissəsi; məs.: Minaxanım, Bəyimxanım, Balacaxanım, Xırdaxanım və s.

**XANIMBÖCƏYİ** *zool.* bax **uçağan**[2].

**XANIMCAN** *is. köhn.* Qadına hörmət və nəvazişlə müraciət. [Qurban:] *Xanımcan, bağışla, sənə ağır gəlməsin, bu dünyadır, elə də olar, belə də.* İ.Musabəyov.

**XANIMƏLİ** *is. bot.* İriyarpaqlı, gözəl ətirli bir çiçək və bu çiçəyin kolu.

**XANIM-XATIN** bax **xanım** 1-ci mənada. [Xəlil:] *Gəncədə elə sizin kimi xanım-xatın bir doktor vardı.* S.Rəhman.

**XANIMLIQ** *is.* 1. Xanım olma, xanım kimi yaşama, hörmətdə olma. *Xanımlıq eləmək.* – [Çəpəl:] *Bəxtəvər qurulu evə gedir, açıq qapıya xanımlığa gedir.* Mir Cəlal.

2. Qadınlıq. [Qadının] *ağıllı baxışı, dolğun sinəsi, həlim və tərənəli səsi – bütün hərəkəti xanımlıq haqqına haiz olduğunu bildirirdi.* Çəmənzəminli.

3. *məc.* Alicənablıq, ağayanalıq, nəciblik [Səkinənin] *oturuşunda, hərəkətində və üzgözündə bir xanımlıq, nəcib bir əxlaqın və mənəviyyatın gözəlliyi duyulurdu.* M.İbrahimov.

**XANIMOTU** *is. bot.* Yarpaqlarında və kökündə atropin olan çoxillik ot bitkisi. *Xanımotu çoxillik ot bitkisidir, hündürlüyü 1-2 m-ə çatan bir neçə düz gövdəyə malikdir.* R.Əliyev.

**XANIMSALLANDI**[1] *bot.* bax **ərikgülü**.

**XANIMSALLANDI**[2] *is. köhn.* Parlaq ipək saplardan toxunmuş bahalı parça. *Keçmişdə xanımlar toylara xanımsallandı geyinərdilər.*

**XANİMAN** *is.* [*fars.*] 1. Ev-eşik, ata yurdu, ocaq, dudman, məskən. *Yolunda keçmişəm şirin canımdan; Tərk oldum vətəndən, xanimanımdan.* Aşıq Ələsgər. *Get ata-ananın tez al qanını; Dağıt Ağpoladın xanimanını.* A.Səhhət. [Cahangir bəy:] *Ta səndən ötəri xanimandan əl çəkib düşmüşəm bərrü biyabanə.* N.Vəzirov.

2. Ev, ev adamları, ailə. *İpək döşəməli xanimanlardan; Rəqqasə qızların səsi yüksəlir.* S.Vurğun. [İsmayıl:] *Uşaqlar, bu xanimanın daşını daş üstə qoymayacağıq, odlayın!* P.Makulu. *Yanan xanimanlardan körpələrin ağlaşma səsləri ucalır.* M.Rzaquluzadə. // Məc. mənada. *Könül xanimanın abad eyləyib; Yıxan gözlərinin sədəqəsi canım.* Q.Zakir. *Könül viran qalan bir xanimandır; Deyib-danışmayır xeyli zamandır.* S.Vurğun.

**XANİMANLI** *sif.* Xanimanı, yurdu, məskəni, ev-eşiyi olan.

**XANİMANSIZ** *sif.* Xanimanı, yurdu, məskəni, ev-eşiyi olmayan; yurdsuz. *Ölürəm imdi burda qürbətdə; Xanimansız, yetim, əsarətdə.*

A.Səhhət. *Bax, küçələrdə seyr edir bir sürü xanimansız; Ac-yalavac zarıldayır arvad-uşaq gümansız.* C.Cabbarlı.

**XANLIQ** *is.* 1. Hakimlik. *Xanlıq sürmək. Xanlıq eləmək. – Bilmirəm neyləyir ol xanlığı ya dünyanı; Hər kimin dövləti vardır, odur əsrin xanı..* S.Ə.Şirvani. [Mirzə Təqi:] *Bəli, İranda xanlıq var ikən İran dirilməz.* C.Cabbarlı.

2. Xana məxsus, xana mənsub. *Xanlıq mülk. Xanlıq imarət. – Hələ əri xanlıq evinə çatmamış, arvad özünü ona yetirmək, onu qaçmağa təşviq etmək istədi.* P.Makulu. // Xanın idarəsi altında olan məmləkət, ölkə, ərazi. *Bakı xanlığı. İrəvan xanlığı.*

**XANZADƏ** *is.* [xan və *fars.* ...zadə] Xan oğlu, xan balası, xan nəslindən olan adam. [İbrahim:] *Bu saat hamı xanzadələrin, şahzadələrin qızları sənə həsəd aparır.* Ə.Haqverdiyev. [Kəndlilər] *Allaha pənah, hələ ki bu şəhərdən gələn xanzadələrin heç birindən xeyir iş baş verməyib – deyib qəzavü-qədərə bel bağladılar.* Çəmənzəminli. [Cəmaləddin:] *..O adama öz tərəfimdən izin verdim və onun sədaqətinə əminəm. Bu, kirmanlı Mirzə Rza adında bir xanzadədir.* C.Cabbarlı.

**XAÓS** [*yun.*] Tam qarışıqlıq, qarmaqarışıqlıq, nizamsızlıq, hərc-mərclik, qaydasızlıq, sistemsizlik. *..Həyat, baş açılmaz bir xaosa çevrilərək, artıq* [Səriyyə və uşaqlarını] *şüursuz və iradəsiz bir cisim kimi öz təkərinin altına alıb əzməyə, ovmağa başladı.* M.İbrahimov.

**XAOTÍK** *sif.* Qarmaqarışıq, qaydasız, nizamsız, sistemsiz.

**XAOTİKLİK** *is.* Qarmaqarışıqlıq, qaydasızlıq, nizamsızlıq, sistemsizlik.

**XAR¹** *is.* [*fars.*] *klas.* 1. Tikan. *Zəhməti bülbül çəkər; Gülü qucar yenə xar.* (Ata. sözü). [Kərəm:] *Bağı tutdu şeyda bülbül naləsi; Gülün bağrı yandı xarın içində.* "Əsli və Kərəm". *Gülşəni-aləmdə bir gül varmı bixar olmasın? Hansı bülbüldür cəfayi-xardən zar olmasın?* M.Hadi.

**XAR²** *sif.* Zəlil, üzüqara, rüsvay, xəcalətli, pərt. *Rüstəmbəy başını çarpayıya söykəyib, xar və zəlil bir halda sükuta getdi, gözləri yaşardı..* Çəmənzəminli. ◻ **Xar etmək (eləmək, qılmaq)** – hörmətdən salmaq, alçaltmaq, üzüqara etmək, başıaşağı etmək, xəcil etmək. *Bunları mənimlə zar qılma; Bir neçə əzizi xar qılma.* Füzuli. *Xar etmə məni hicrin ilə, ey güli-bixar; Gülşəndə haçan gül eləyib xarə ədavət.* S.Ə.Şirvani. *Yalnız teatr sevgisi onları dost-düşmən yanında xar eləyir, ata-ana yanında başıaşağı edərdi.* S.Rəhman. **Xar olmaq** – alçalmaq, hörmətdən düşmək, hörməti getmək, üzüqara olmaq. *Mərdlər ilən gəz ki, vəfadar olur; Nakəslərə yoldaş olan xar olur.* M.V.Vidadi. [Naçalnik:] *Sizin nəcabətinizə hərgiz layiq deyil ki, yaman əməllər ilə özünüzü bədnam edib, ümənayi-dövlətin nəzərində xar və zəlil olasınız.* M.F.Axundzadə.

**XAR³** *sif.* Yumşaq, boş, məsaməli. *Xar buz.*

**XARA** *is.* Özündən naxışları olan parlaq ipək parça. *Gün vurduqca ağacların yarpaqları rəngdən-rəngə düşür, xara parça kimi bir anda cürbəcür rəngə çalırdı.* Ə.Vəliyev. [Sərvinaz Şahmara:] *Ata-babamız öz üstünə çəkməyə mitil tapmayanda, xaradan qonaq yorğanı düzəltdirib.* B.Bayramov. *Xaradan uzun xalat geyinmiş bəstəboy, zərif bir qadın pilləkənlə enirdi.* İ.Hüseynov. // Xaradan tikilmiş. *Xara don, xas labada; Şəddə üstə şalı qəşəng.* Aşıq Ələsgər. [Əminə] *qıvraq görkəminə çox yaraşan baftalı, uzun xara tuman .. geymiş, başına da heyratı kəlağayı örtmüşdü.* Ə.Əbülhəsən.

**XARAB** *sif.* [*ər.*] 1. Pis, yaman. [Kərbəlayı Cəfər:] *..İndi əsr çox xarabdı. Hanı indi elə bir Allah bəndəsi ki adamın əlini tutsun...* C.Məmmədquluzadə. [Əvvəlinci kəndli:] *Həkim birgünlük yolda olur; yollarımız xarab, azarlını nə arabada aparmaq olur, nə at ilə..* Ə.Haqverdiyev. // Bərbad, viran. *Dərdi-qəmi göndər könül şəhrinə; Heç sultan mülkünü xarab istəməz.* Q.Zakir.

2. Ağır, pis. *Halı xarabdır.* ◻ **Xarab olmaq** – 1) get-gedə pisləşmək, ağırlaşmaq, qorxulu bir vəziyyət almaq (xəstə haqqında). [Humay:] *Ah, nə fəlakətli təsadüf... Zavallı xəstəliyindən büsbütün xarab olacaq..* H.Cavid; 2) sınmaq, dağılmaq, korlanmaq. [Ağakərim xan:] *Vay sənin halına, hərgah bir səndəl, ya miz xarab ola.* N.Vəzirov;

3) pisləşmək, pis cəhətə dəyişmək, korlanmaq. [Məşədi İbad:] *Arvad ki döyülmədi, xarab olar.* Ü.Hacıbəyov. [Əlləzoğlu:] *Ə, biz, deyəsən, ərli-arvadlı lap xarab olmuşuq, ay Hənifə.* İ.Hüseynov.

3. Əvvəlki keyfiyyətini, vəziyyətini dəyişmək, itirmək, yaramaz hala düşmək. *Nə tez soldun, xarab oldun! Nədir sənin bu tutduğun; Vəfasızlıq yolu, bilməm! Sənin ömrün nə qədər kəm!* Ə.Cavad.

4. Bir sıra isimlərin yanına gətirilərək, ismin göstərdiyi mənada feil, yaxud müxtəlif ifadələr düzəldilir; məs.: qanını xarab etmək, ovqatını xarab etmək, ürəyi xarab olmaq, işlər xarabdır və s.

**XARABA** [*ər.*] 1. *is.* Dağılmış, uçulmuş, viranə qalmış şəhərin, tikilinin və s.-nin qalığı; yarı yıxıq ev və s.; xarabalıq. *Bizdən sonra kəndlilər Pəri arvadı və uşağını xarabadan çıxartmışdılar.* C.Məmmədquluzadə. *Bayquş xaraba, gecəquşu qaranlıq sevən kimi, xain adamlar da xəlvəti xoşlarlar.* M.İbrahimov. *Alçaq, yastı və torpaq evlərdən buranın kiçik bir kənd xarabası olduğu anlaşılırdı.* Ə.Məmmədxanlı.

2. *sif.* Dağılmış, uçulmuş, alt-üst olmuş, xaraba qalmış; viranə, yıxıq, uçuq. *Xaraba şəhər. Xaraba kənd. Xaraba evlər. – Könül şəhri gündən-günə talandı; İndi oldu bir xaraba çöllər hey.* M.V.Vidadi. *Xaraba və başlı-başına buraxılmış bir binanın içərisində toxdayıb oturdum.* M.S.Ordubadi. *Gülbənd bacısı Tamamın hər şeydən çox xaraba qəbiristandan qorxduğunu söylərdi.* S.S.Axundov. □ **Xaraba qalmaq** – uçulmaq, dağılmaq, viran olmaq (bəzən qarğış kimi – xaraba qalsın! xaraba qalasan! şəklində işlənir). [Qərib:] *Xaraba qalsın Tiflis şəhəri; Heç səndə oynayıb-gülən yoxumuş.* "Aşıq Qərib". *Gözəl Təbriz xaraba qalır, toz-torpaq içində sönüb gedir.* M.İbrahimov. *İş belə gedərsə, Gəray ağanın Qarabağ düzənlərindəki malikanəsi, Şuşa şəhərindəki üçmərtəbəli imarəti də xaraba qalacaq...* S.Rəhimov. **Xaraba qoymaq** – dağıtmaq, viran etmək, uçurmaq, daşı daş üstə qoymamaq, xarabalığa döndərmək. [Cənnətəli ağa:] *Ay gədələr, dalımca gəlin!.. Gərək dünyavü aləmi xaraba qoyam!* N.Vəzirov. // *klas.* Məc. mənada. *Bu dil ki ona mənzil idi, oldu xərabə; Əzm etsə əgər yar, dəxi harə qayıtsın?* Heyran xanım.

3. *dan.* Öz evi, öz mülkü, öz yeri mənasında (hiddət məqamında deyilir). [Kərbəlayı Ağca:] *Min dəfə deyirəm, bu zəhrimar çəpəri öz xarabanızdan çəkin!* Çəmənzəminli. [Paşa bəy Səlbiyə:] *Onsuz da qanım qaradır, çıx cəhənnəm ol, itil get xarabana!* Ə.Vəliyev. [Münəvvər:] *Qoymaz ki, itin küçükləri xarabamızda bir hovr rahat nəfəs alaq.* Mir Cəlal.

4. B a x **xarabaxana**. *Çox görmüşəm qana batmış əlləri mən; Çək tətikdən əllərini; Yüz xaraba, min xaraba müəllifi əllərini.* M.Araz.

**XARABAXANA** b a x **xarabalıq**. [Bəyməmməd:] *O yel vurub, yengələr oynayan xarabaxana? Bəs atam nə deyər.* S.Rəhimov.

**XARABALANMA** "Xarabalanmaq"dan *f.is.*

**XARABALANMAQ** *f.* Xarabalığa dönmək, xaraba qalmaq, dağılmaq, bərbad olmaq, viranələnmək.

**XARABALAŞDIRMA** "Xarabalaşdırmaq"-dan *f.is.*

**XARABALAŞDIRMAQ** *f.* Xaraba halına gətirmək, dağıtmaq, viranə etmək, viran qoymaq.

**XARABALAŞMA** "Xarabalaşmaq"dan *f.is.*

**XARABALAŞMAQ** b a x **xarabalanmaq**.

**XARABALIQ** *is.* Xarabaya çevrilmiş yer, dağılmış, sökülmüş, viran qalmış yer; viranəlik. *Kənddə təsərrüfat alətləri yay-qış uçuq-sökük, qar-yağış tökülən bir xarabalıqda saxlanılırdı.* M.İbrahimov. *Ay işığında* [yolçu] *bir xarabalıq qarşısında dayandığını gördü.* Ə.Məmmədxanlı. *Xarabalıq üzərində iki bayquş edir söhbət; Nuşirəvan bu söhbətin təsirindən alır ibrət.* B.Vahabzadə.

**XARABAZAR** *is.* [*ər.* xərabə və *fars.* ...zar] *klas.* Xarabalıq, viranəlik, xaraba qalmış yer. [Mirzə Sadıq Fərhada:] *Oğlum, xarabazarlar arasında abadlıq axtarma.* C.Cabbarlı. [Qurd Kərim:] *Hər yana baxırsan xarabazardır; Dolub dilənçiylə küçə və meydan.* S.Rüstəm.

**XARABAZARLIQ** b a x **xarabalıq**. *Xəyalımda bizim Şərq nağıllarında təsvir edilən xarabazarlıqlar canlandı.* M.İbrahimov. *Dağınıq və uçuq evləri, .. küçələrə tökülmüş*

*sınıq qab-qacaqları görərkən, dağılmış insan yurdunun bu xarabazarlığı qarşısında yolçunun ürəyi sıxıldı...* Ə.Məmmədxanlı.

**XARABÇILIQ** *is. dan.* Pislik, murdarlıq.

**XARABEDİCİ** *sif.* Xarab edən, dağıdıcı, viranedici.

**XARABLAMA** "Xarablamaq"dan *f.is.*

**XARABLAMAQ** *f.* 1. Korlamaq, pisləşdirmək. *İşləri xarab eləyən araqarışdıranlardır ki, müsəllamızı xarablayırlar.* C.Məmmədquluzadə.

2. *məc. dan.* Batırmaq, bulamaq, murdarlamaq. *Ölünü öz kefinə qoysalar, kəfəni xarablar.* (Ata. sözü).

**XARABLAŞDIRMA** "Xarablaşdırmaq"-dan *f.is.*

**XARABLAŞDIRMAQ** *f.* Xarab eləmək, korlamaq, pisləşdirmək, bərbad hala salmaq. // Ağırlaşdırmaq, kəsifləşdirmək. *İnsanların tənəffüs zamanı havaya buraxdıqları karbon qazı, habelə yaş və ya çirkli paltardan qalxan buxar, toz binanın havasını xarablaşdırır.* Ə.Babayev.

**XARABLAŞMA** "Xarablaşmaq"dan *f.is.*

**XARABLAŞMAQ** *f.* Pisləşmək, daha da xarab olmaq, fənalaşmaq, korlanmaq. [Həsənqulu bəy:] *Həzərat! Özünüzə məlumdur ki, dünya getdikcə xarablaşır, yəni mən onu demək istəyirəm ki, bu dünya getdikcə xarab olur.* Ü.Hacıbəyov. *Kişinin ovqatı daha da xarablaşır, oyan-buyanı, axtarar, əlinə təndir kösöyü götürüb, itə bir-iki çəkərdi.* H.Sarabski. *Gülşən işdən çıxanda günortadan pozulmağa başlayan hava get-gedə daha da xarablaşdı.* M.Süleymanov.

**XARABLIQ** *is.* Xarab şeyin halı, keyfiyyəti; pislik, bərbadlıq, fənalıq.

**XARÁKTER** [*yun.*] 1. B a x **xasiyyət**. *Zeynalda xudkam bir sənətkar xarakteri vardı.* S.Hüseyn. *Mahnı xalqın milli xarakterini canlı surətdə ifadə edən böyük bir ilham məhsuludur.* Ə.Bədəlbəyli.

2. *ədəb. inc.* Tip, surət, obraz. *M.F.Axundzadənin komediyaları böyük ictimai məsələləri əhatə edən, komik planda ictimai xarakterlər yaradan klassik komediya əsərləri idi.* M.İbrahimov.

3. Mahiyyət, keyfiyyət, xüsusiyyət. *Yer səthinin xarakteri.*

4. **Xaraktercə** şəklində – xarakterinə görə; xasiyyətinə görə, mahiyyətinə görə; xasiyyətcə, mahiyyətcə. "*Atabəylər*" *dramında gərgin hadisələrlə yanaşı, xaraktercə bir-birinə zidd olan obrazlar da nəzəri cəlb edir.* M.İbrahimov.

**XARAKTÉR, XARAKTERİK** *sif.* [*yun.*] b a x **səciyyəvi**. *Xarakterik cəhət. – Qlier Azərbaycan mövzusunda* ["Şahsənəm"] *opera yaradarkən folklorumuzun bütün melodiya zənginliyindən istifadə edə bilməmiş, Azərbaycan musiqisinin lad, vəzn və nüanslarının bütün xarakterik xüsusiyyətlərini öyrənə bilməmişdir*. Ü.Hacıbəyov.

**XARAKTERİSTİKA** [*yun.*] 1. Bir şəxsin və ya şeyin səciyyəvi xüsusiyyətlərinin təsviri.

2. Birinin əmək və ictimai fəaliyyəti haqqında məlumat verən rəsmi sənəd, xasiyyətnamə.

3. *riyaz.* Onluq loqarifmin bütöv hissəsi.

4. *xüs.* Bir şeyin hər hansı bir qrafik (cizgilərlə) göstəricisi. *Turbinin xarakteristikası. Çay rejiminin xarakteristikası.*

**XARAKTERİZƏ: xarakterizə etmək** – xarakteristika vermək, fərqləndirici xüsusiyyətlərini müəyyənləşdirmək; səciyyələndirmək.

**XARAKTERLİ** *sif.* Xarakterə malik olan, səciyyəvi xüsusiyyətlərə malik olan; səciyyəvi. *Cəngavər xarakterli tiplər yaratmaq.*

**XARAKTERSİZ** *sif.* Möhkəm xarakteri, heç bir səciyyəvi xüsusiyyəti olmayan, çox tez təsir altına düşən, zəif iradəli. *Xaraktersiz surətlər.*

**XARAKTERSİZLİK** *is.* Möhkəm xarakteri olmama, çox tez təsir altına düşmə; iradə zəifliyi.

**XARAL** *is.* İri torba (kisə), bardan. *Nənəm qarala, qoyun! Bənzər marala, qoyun! Çoban yununu qırxıb; Basar xarala, qoyun!* (Bayatı). *Öz vaxtında ayırmadın şahini sardan; Az qoşmadın boş xarallar şəninə dastan.* M.Araz.

**XARÇO** *is.* [*gürcücə*] Qoyun ətindən bişirilən bozbaşaoxşar ədviyyəli xörək, şorba.

**XARDAL** *is.* 1. *bot.* Xaççiçəklilər fəsiləsindən xırda sarı çiçəkləri və meyvəsi olan

ot bitkisi. *Xaççiçəklilər fəsiləsinə bir sıra kələm, turp, vəzəri kimi qiymətli tərəvəz bitkiləri, xardal kimi yağlı bitkilər, mixəkgülü, şəbbugülü kimi bəzək bitkiləri daxildir.* H.Qədirov.

2. Xörəyə kəskin dad vermək üçün bu bitkinin üyüdülmüş tumlarından hazırlanan şirə. □ **Xardal yaxısı** – xardal yaxılmış (sürtülmüş) kağız parçası (müalicə məqsədilə işlənir).

**XARDALLI** *sif.* Tərkibində xardal olan.

**XARIBÜLBÜL** *is.* [*fars.* xar – tikan və bülbül.] Azərbaycanda bitən bitki növü. *Açma xarıbülbül, açma, sən bu il; Görürsən, bu bahar bizimçün deyil.* B.Vahabzadə.

**XARILDAMA** "Xarıldamaq"dan *f.is.*

**XARILDAMAQ** *f.* Ayaq altında tapdalanan qardan xar-xar səsi çıxmaq. *İşıq düşər qar üstünə parıldar; Tapdalayan vaxtda onu xarıldar.* A.Səhhət. *Qar atların ayaqları altında qəribə bir səslə xarıldayırdı.* M.Hüseyn.

**XARILDAŞMA** "Xarıldaşmaq"dan *f.is.*

**XARILDAŞMAQ** *f.* Küləyin təsirilə yarpaqların, budaqların bir-birinə dəyməsindən çıxan səs haqqında – xışıldamaq. *Külək əsdikcə yarpaqlar xarıldaşırdı. – Meşəni çulğayan dərin uğultu bir neçə saniyə kəsilmədi. Ağaclar xarıldaşdı.* M.Hüseyn.

**XARILTI** b a x **xışıltı**. *Xarıltı səsi.* □ **Xarıltı ilə** – xarıltı səsi çıxararaq, xışıltı ilə. [Məryəm:] *Sən məni unutsan da, amma mən səni unutmaram, – deyə işvəkar qadınlara məxsus bir şivə ilə fırlanıb ipək paltarlarını xarıltı ilə yellətdi.* B.Talıblı. *Payız yağmurlarından aşıb-daşan çay iri yumru daşları xarıltı ilə yuvarlayıb aparırdı.* M.Rzaquluzadə.

**XARİC** *is.* [*ər.*] 1. Bayır, dışarı; bayır tərəf (*daxil* əksi). *Binanın xarici. Bu evin xarici daxilindən gözəldir. – Sonra birdən o, xaricdən gələn səslərə qulaq asmağa başlayır.* S.Rəhman. □ **Xaric etmək** – qovmaq, kənar etmək, çıxarmaq. [Fərhad Mirzə Sadığa:] *Baba, tez məni* [saraydan] *xaric edin.* C.Cabbarlı. *Yoldaşlarından birini bıçaqlayıb yaralamağının üstündə Əmiraslanı məktəbdən xaric etdilər.* S.S.Axundov. **Xaric olmaq** – kənar olmaq, çıxmaq. [Qızıl Arslan:] *Bu məktubu alandan bir həftəyə qədər öz qoşununu padşaha təslim verib islam məmləkətlərindən xaric olmalısınız!* M.S.Ordubadi.

2. Xarici ölkə, məmləkət. *Xaricdən gələn mallar. Xaricdə yaşamaq. – Günlər keçir, xaricdən qəsəbəyə kimsə gəlməyirdi.* H.Nəzərli.

3. Musiqidə: mövcud ölçü və ahəngdən kənara çıxma, yanlış çalma, ya oxuma. *Xaric vurub zil pozuldu; İndi bəmdən oxu, bülbül.* N.Kəsəmənli.

◊ **Xaric dəftəri** *dəft.* – idarədən çıxan məktubları, təliqələri qeyd etmək üçün dəftər.

**XARİCİ** *sif.* [*ər.*] 1. Xaricə aid, zahiri (*daxili* ziddi). *Xarici əlamət. – Mahmuda xarici görünüşünə görə paxıllıq edənlər də olurdu.* S.Vəliyev. // Bir şeyin xaricində, xaric tərəfində olan. *Xarici tərəf. Xarici mühit. – Qəhrəman o qəbil insanlardan idi ki, .. xarici aləmdə heç bir şey görməz və eşitməzdi.* M.İbrahimov. *Elə bil bu saat bütün xarici aləm yalnız sədrdən asılı idi.* İ.Əfəndiyev.

2. Xarici dövlətlə olan münasibətlərə aid (*daxili* ziddi). *Xarici siyasət. Xarici vəziyyət. Xarici ticarət.* // Həmin dövlətin hüdudları xaricində olan. *Daxili və xarici qiymətlər. Xarici bazar. Xarici düşmənlər.* // Xarici ölkədən gəlmiş və ya gətirilmiş. *Xarici qonaqlar. Xarici mal.* // Başqa dövlətə, başqa ölkəyə mənsub olan, aid olan. *Xarici təbəələr. Xarici valyuta. Xarici dillər.* // *İs. mənasında.* Əcnəbi, xarici ölkə təbəəsi. *Bakı neft yataqları xariciləri özünə çəkirdi.* M.İbrahimov. // *is. köhn.* İslam aləmində qeyri-müsəlmanlara verilən ad; əcnəbi. [Hacı:] *Hayıf olsun ki, siz də xaricilərə qoşulub məni yerdən götürməyə çalışırsınız.* M.S.Ordubadi. *Hacı Əliqulu, doğrudur, bir xarici ilə əl-ələ görüşəndə gəlib evdə əlini sabunla təmizlərdi.* Qantəmir. *Xaricilər qabağa düşdü tamam; Nə yaman günlərə qaldı islam.* A.Səhhət.

**XARİCİYYƏ** *is.* [*ər.*] Xarici işlər nazirliyinin köhnə adı. *Osmanlının xariciyyə vəziri gəlib sultana ərz edəndə ki, sultan sağ olsun, Yevropa hökumətləri Kriti hazırlaşırlar versinlər yunan padşahına, Sultan Əbdülhəmid yunanlı hərəmini yanına çağırıb deyir:*

.. *İstambula yazaram, "Molla Nəsrəddin"i Osmanlı torpağına qoymasınlar.* "Hophopnamə".

**XARİQƏ** *is.* [*ər.*] 1. İnsanda heyranlıq doğuran şey, hadisə; möcüzə. bax **xariqüladə**.

2. *məc.* Adama xariqə kimi görünən, xariqə sayıla bilən şey, qeyri-adi, görünməmiş şey. *İnsanın zəkası xariqələr yaradır.* – [Nəcməddin] *Böyük şairin* [Nizaminin] *bu qədər qilu-qal içərisində keçən günləri sakit bir həyatın qucağında xariqələr, möcüzələr dolu şeirlər yaratmağa sərf olunacaqdır.* M.S.Ordubadi.

**XARİQƏLİ** *sif.* Xariqüladə, xariqələrlə dolu, ecazkar, möcüzəli, görünməmiş. *Burada xariqəli bir şey yoxdur.*

**XARİQÜLADƏ** *sif.* [*ər.*] 1. Qeyri-adi, qeyri-təbii, bu vaxta qədər misli görünməmiş, təbiət xaricində olan. *Xariqüladə qüvvələr. Xariqüladə hadisələr. Xariqüladə qəhrəmanlıq.*

2. Adi qaydadan xaric, qeyri-adi, fövqəladə. *Boşanmaq təklifi* [Mehriban] *üçün xariqüladə bir şey idi.* S.Hüseyn. *Amma Saday yoldaşlarına ürək-dirək verəndə, elə xariqüladə bir qüdrət sahibi olduğunu bilməzdi.* M.Hüseyn. *Mahmud Sərdarın dediyinə inanmırmış kimi, bir an quruyub qaldı. O, xariqüladə bir qüdrətə malik zənn etdiyi bu adamın vurula biləcəyinə heç cür inanmazdı.* P.Makulu.

**XARİQÜLADƏLİK** *is.* Qeyri-adilik, fövqəltəbiilik, fövqəladəlik; ecazkarlıq. *Hadisənin xariqüladəliyi.*

**XARLAMA** "Xarlamaq"dan *f.is.*

**XARLAMAQ** *f.* Bərkimək (qar, ərgin şəkər haqqında). [Qırmızı qan ləkələri] *xarlamış qar üzərində nar dənələri kimi qızarır, sağda-solda bir ovuc mərcan kimi göyümtül rəngə çalan qar üzərinə səpələnirdilər.* Ə.Məmmədxanlı. *Hava açılır, dağlarda yumşalıb xarlayan qar əriyir, dərələr səslənir, Xaçının qıjıltısı hər saat güclənirdi.* B.Bayramov.

**XARLANDIRMA** "Xarlandırmaq"dan *f.is.*

**XARLANDIRMAQ** *f.* Şəkərə döndərmək, şəkərləndirmək.

**XARLANMA** "Xarlanmaq"dan *f.is.*

**XARLANMAQ** *f.* Şəkərə dönmək, şəkərlənmək. *Bal xarlanıb. Mürəbbə qalıb xarlanıb.*

**XARLANMIŞ** *f.sif.* Şəkərə dönmüş, şəkəri artmış, şəkərdən bərkimiş. *Xarlanmış bal.*

**XARRAT** *is.* Ağac və taxtadan müxtəlif şeylər qayıran usta; doğramaçı. *Bir yanda xarratlar taxta yonub rəndələyir, qapı-pəncərənin çərçivəsini yerinə salır, döşəməni düzəldirdilər.* M.İbrahimov. *Xarratlar taxtaşalban işlərini qurtarmış, çilingərlər də mexanizmlərin əgər-əskiyini düzəldib qaydaya salırdılar.* M.Hüseyn.

**XARRATXANA** *is.* Xarrat emalatxanası.

**XARRATLIQ** *is.* Xarrat sənəti, peşəsi. [Nizami:] *Təbibə ehtiyacı çox olan məmləkətlərdə insanın təbibliyə olan marağı hər şeydən artıqdır. Elə də dəmirçilik, xarratlıq, dərzilik və başmaqçılıqdır.* M.S.Ordubadi.

**XART** *təql.* Bərk, kövrək bir şeyi dişlə doğradıqda, ya kəsdikdə çıxan səs.

**XARTAXART** *zərf* Xartıldadaraq, xartıltı ilə. *Bərk almanı xartaxart yemək. Qəndi xartaxart çeynəmək.*

**XARTILDATMA** "Xartıldatmaq"dan *f.is.*

**XARTILDATMAQ** *f.* Xartıltı ilə sındırıb yemək. *Ömər xan sözünü bitirərək qabdan bir qazmaq götürüb, sağlam dişlərlə xartıldatmağa başladı.* Çəmənzəminli.

**XARTHAXART** bax **xartaxart**. [Qəndi] *.. ağzıma salıb bir qədər sorduqdan sonra dilimin ucu ilə dişlərimin altına ötürüb xarthaxart yeyərdim.* Qantəmir. [Tapdıq] *hər dəfə çay içəndə bir yekə tikə qənd ağzına qoyur və xarthaxart yeyirdi.* Ə.Vəliyev.

**XÁRTİYA** *is.* [*yun.*] 1. Qədim əlyazması (papirus və perqamentdə).

2. İctimai-siyasi sənəd.

**XARTUT** *is.* İri qara tut. *Tut cinsinin Azərbaycanda əsas üç növü bitir: ağtut, xartut və qırmızı tut və ya çəkil.* M.Qasımov. [Bayram kişi:] *Bunlardan başqa, iydə, innab, qaratut, xartut da buralarda çox yaxşı olur.* M.Rzaquluzadə.

**XAS**[1] *sif.* [*ər.*] 1. Yalnız bir adama və ya şeyə məxsus olan, onun üçün səciyyəvi olan, yalnız bir adamda və ya şeydə olan. *Balaca Azad təbiətinə xas bir hay-küylə kənarda oynayır.* M.İbrahimov. *Güləsər*

*yeniyetmə kənd qızlarına xas olan bir qəmzə ilə boynunu bükdü və dinməz-söyləməz çardaqdan endi.* İ.Şıxlı.

2. Saf, xalis, qatışıqsız, təmiz. *Xas polad. – Tən köynəyi xas qırmızı; Gülgəzli xaradan yaxşı.* (Qoşma).

3. *tar.* Hökmdarın şəxsən özünə məxsus olan. *Xas əsgər.* – [Şah əşxasa:] *Sizi bir əmrdən ötrü məsləhətə çağırmışam, gərək haman xüsusda bir tədbir göstərəsiniz. Çünki bu məclisi-xasdır, ona binaən mənim tərəfimdən icazət olunur ki, oturasınız.* M.F.Axundzadə. *Toğrulun məktubunu aparanlardan birisi onun xüsusi katibi Əbülqədir, ikincisi xas qulamlardan Cəmad, üçüncüsü isə Mülhimdir.* M.S.Ordubadi.

4. *köhn. klas.* Əsil, nəcabətli, əsilli, əsil-nəsəbli; əyan, kübar.

**XAS**[2] *is.* Həftənin ikinci günü, çərşənbə axşamı; tək günü.

**XASA** *sif.* [*ər.*] Yaxşı bişmiş (qızarmış), bürüştə, əla. [Çörəkçi:] *Gəl, müştəri, gəl görək, tazadır xasa çörək...* M.S.Ordubadi.

**XAS-XALİS** *sif.* [*ər.*] *köhn.* Əsil, əsilli, nəcabətli, əsil-nəsəbli. *Zakir özü Qarabağın xas-xalis nücəbalarından ola-ola, öz həmsinfinin ayıb və qüsurlarını belə açıq, mərdanə və şairanə söyləməyi, əlbəttə, şayani-təhsirdir.* F.Köçərli.

**XASİYYƏT** *is.* [*ər.*] 1. İnsanın hərəkət və davranışlarında özünü göstərən əsas və ən sabit psixik xassələrinin səciyyəsi xüsusiyyətlərinin məcmusu, təbiətində olan xüsusiyyət, xarakter. *Yumşaq xasiyyət. Sərt xasiyyət. – Üz bürüməz yar yarını görəndə; Bu xasiyyət nədi, bilməzəm səndə?* Q.Zakir. *Atalar demişkən:* "*Atı atın yanına bağlarsan, ya halını götürər, ya xasiyyətini*". C.Məmmədquluzadə. *Nola, gər atəşi-eşq ilə yansaq, şöləmiz yoxdur; Bu xasiyyət bizə nə şəm, nə də pərvanələrdəndir!* Ə.Vahid.

2. Bir şeyə xas olan hal, xüsusiyyət. *Sənə həm gül verir, həm də qar verir; Budur xasiyyəti bizim dağların.* S.Rüstəm. *Bu yerlərə yaxşı bələd olan Şahin dumanın da xasiyyətini bilirdi.* B.Bayramov.

**XASİYYƏTCƏ** *sif.* Xasiyyətinə görə, təbiətinə görə, təbiətcə. *Xasiyyətcə gözəl adam. Xasiyyətcə tərsdir. – Aşıq azarkeşləri yaxşı bilirdilər ki, xasiyyətcə tündməcaz olan və tez əsəbiləşən Aşıq Alı çuğulların belə sözlərindən qəzəblənəcək və Aşıq Ələsgərlə deyişəcəkdir.* "Aşıq Ələsgər".

**XASİYYƏTNAMƏ** *is.* [*ər.* xasiyyət və *fars.* ...namə] Bir şəxsin ictimai və əmək fəaliyyətini təsvir edən rəsmi sənəd; xarakteristika. *İş yerindən xasiyyətnamə almaq. – Lalə dünən baş mühəndisin texniki imtahandan keçirdiyi adamlara dair yazıb verdiyi xasiyyətnamələrlə tanış olurdu.* M.Hüseyn. [Qoçəlinin] *döyüş xasiyyətnaməsi olmadığından ərizəsini ləngitmək istəyirdilər.* Ə.Vəliyev.

**XASSƏ** *is.* [*ər.*] Bir adama və ya şeyə məxsus olan hal, bir adamda və ya şeydə olub, başqalarında olmayan keyfiyyət; xasiyyət. [Rüstəmbəy Vəlibəyə:] *Hər şeyi tərsinə başa düşmək* [Cəfərdə] *bir xassədir.* Çəmənzəminli. // Keyfiyyət, xüsusiyyət. *Mədən sularının şəfaverici xassələri.*

**XASSƏLİ** *sif.* Xassəsi, xüsusiyyəti, müəyyən keyfiyyəti olan. *Müxtəlif xassəli maddələr.*

**XAŞ** *is.* Kəlləpaçadan hazırlanıb sarımsaqla yeyilən xörək.

**XAŞA**[1] *is. bot.* Paxlalılar fəsiləsindən yem bitkisi; esparset. *Əkilən qarayonca, üçyarpaq yonca növləri, xaşambul .. və xaşanın yabanı bitən və əkilən-becərilən növləri çox gözəl yem bitkisi olub, ottarlalı əkin sistemində geniş tətbiq edilir.* M.Qasımov.

**XAŞA**[2] *is.* İri torba, xaral. *Gəlin Xəlildən bir neçə addım sağda qoyulmuş iri xaşaya doğru yönəlib önlüyünü boşaltdı.* M.Hüseyn.

**XAŞAK** *is.* [*fars.*] *köhn.* Çör-çöp, zir-zibil, xırım-xırda. *Çarparaq cari olan bunca məarif seylinin; Qarşısın sədd etməyə qabilmidir xaşaklər?!* M.Ə.Sabir.

**XAŞAL** *sif. dan.* Sallaq (yekə) qarın, şişman. *Burnu biz, qarnı xaşal; Bu pis, löyün başdı birə.* Aşıq Ələsgər. *Qarnı xaşal, qurşağı örkən kimi; Gözləri göy, sinəsi xırman kimi.* Ə.Nəzmi. [Həşim] *əllərini xaşal qarnının üstündə çarpazladı.* İ.Hüseynov.

**XAŞALIQ** *is.* Xaşa bitmiş yer. *Araz qırağındakı qamışlıq, kəndin ətrafındakı yoncalıq və xaşalıq .. Gülşənin çox xoşladığı və həzz aldığı şeylərdən idi.* Ə.Vəliyev.

**XAŞALQARIN** *sif. dan.* Yekəqarın, şişman. *Xaşalqarın kişi.*

**XAŞALLAŞMA** "Xaşallaşmaq"dan *f.is.*

**XAŞALLAŞMAQ** *f. dan.* Qarnı yekəlib sallanmaq, xaşal olmaq. *Kişinin qarnı lap xaşallaşıb.*

**XAŞAMBUL** *is. bot.* Sarı-ağ salxımvari çiçəkləri olan xırda yarpaqlı hündür çoxillik ot. *Xaşambul çoxillik bitkidir. Hündürlüyü təxminən bir metr olan qol-budaqlı gövdəsinin üzərində saplaqlı xırda yarpaqları yerləşmişdir. Sarı rəngli çiçəkləri salxıma oxşayır.* R.Əliyev.

**XAŞXAŞ** *is. bot.* 1. Tərkibində süd şirəsi olan iri çiçəkli və içi xırda toxumlarla dolu qozaşəkilli meyvə verən bitki. *Xaşxaşlar cinsi .. birillik, ikiillik və ya çoxillik otlardır. Süd şirələri ağdır.* M.Qasımov. *Lalələr tökülüb qurtarmış, xaşxaş gömgöy göyərirdi.* Ə.Vəliyev.

2. Bu bitkinin yeyilən xırda toxumları. *Çörəyə, qoğala xaşxaş vurmaq. – Xərc edir bir para əşxas pulun bayramda; Zəfərana, yağa, razyanayə, xaşxaşə, ətə.* M.Ə.Sabir. // Bu bitkinin tiryək hazırlanan qozası.

**XAŞXAŞGÜLÜ** *is. bot.* Qızılı və ya ağ çiçəkləri olan kol-bitki.

**XAŞXAŞLIQ** *is.* Xaşxaş əkilmiş yer.

**XATA** *is.* [*ər.*] 1. B a x **xəta**. // Qəbahət, qüsur, günah, yanılma, istənilmədən edilən səhv. *Kiçikdən xata, böyükdən ətə.* (Ata. sözü). ☐ **Xata eləmək** – səhv iş görmək, yanılmaq, səhv etmək. [Koroğlu:] *Koroğlu eylədi xata; İndi sən bax bu büsata.* "Koroğlu".

2. Qorxu, təhlükə, xətər ehtimalı. *Sənin xatan var. Xatadan qurtarmaq.* // Qorxulu, təhlükəli, faciə ilə nəticələnə bilən iş, hərəkət, əməl; qorxu, təhlükə. *Bəzi yerdə çiy ət yemək adətdir, çiy əti zəif xəstəyə və uşağa da verirlər. Amma belə çiy ət yeməyin xatası var.* H.Zərdabi. *Bu xatadan sovuşsam, çarmıxa çəksələr də; Ağzımı kilidlərəm, danışmaram bir daha.* B.Vahabzadə.

◊ **Xata baş vermək** – ölüm və ya başqa ağır bir hadisə üz vermək. [İlyas Adiləyə:] *Anamın da ürəyinə dammışdı ki, əgər mən Tərlanı minsəm, nə isə bir xata baş verəcək.* Ə.Məmmədxanlı. **Xata çıxar(t)maq** – faciə ilə nəticələnə və ya pis nəticəsi ola biləcək bir iş görmək. [Ata:] *O qalmışdı bir xata çıxardasan?* S.Rəhimov. [Mindilli:] *Yenə komissiya? Əşi, xata çıxarma, dayan...* S.Rəhman. **Xata dəymək** – bəla üz vermək, xətər toxunmaq, zərər dəymək. *Öz əlimlə xata dəydi özümə; Bədəndən qolumun sağı kəsildi.* Aşıq Ələsgər. **Xatada qalmaq** – pis, çıxılmaz vəziyyətdə qalmaq, əngələ düşmək. *İşə zərbə vurmuşam?! Ya işə gecikmişəm?! Əcəb kələyə düşdük, əcəb qaldıq xatada.* S.Rüstəm. **Xatanı başdan eləmək** – gözlənilən təhlükədən uzaqlaşmaq, uzaqlaşdırmaq, qorxudan çıxmaq. *Rəhim bəy, bir bəri gəl! Allahı sevirsən, bu xatanı mənim başımdan elə, al bu on manatı da qəndə, çaya ver, bu donuzu mənim qapımdan uzaqlaşdır.* Ə.Haqverdiyev. **Xatası başdan olmaq** – xatası, təhlükəsi aradan qalxmaq, yox olmaq, sovuşmaq. *Veysin xatası başdan olsaydı,* [Allahqulunun] *fikrincə, qalan hər şey öz yolu ilə düzələcəkdi.* Ə.Əbülhəsən. **Xataya düşmək** – əngələ düşmək, təhlükəli vəziyyətə düşmək. *Heç nədən xataya düşən dəllək diz qapaqları titrəyə-titrəyə küncə dayandı.* S.Rəhimov. [Qurban Telliyə:] *Həmişə yuxumda dəvə görəndə o biri gün xataya düşürəm, Telli.* Ə.Məmmədxanlı. **Əlindən xata çıxmaq** – istəmədən adam öldürmək, qan tökmək. [Səkinə xanım:] *Nə söyləyirsən, sən dayan, getmə, əlindən xata çıxar!* M.F.Axundzadə. [Mirzə İsmayıl:] *Dəli iyiddir. Əlindən xata çıxa bilər.* Ə.Haqverdiyev. **Öz(ü)-özünü xataya salmaq** – gördüyü işin nəticəsini fikirləşmədən işini əngələ salmaq, özünü çətin vəziyyətə, bəlaya salmaq. [Səlimqızı:] *Ay balam, özünüzü xataya salmayın.* C.Cabbarlı.

**XATA-BALA** *is.* 1. Xata, qorxu, təhlükə; xətərli, təhlükəli iş. *Xata-baladan uzaq olmaq. –* [Ağca:] [Tapdığı] *xata-baladan mənim duam saxlayıb.* Ə.Əbülhəsən.

2. Dərd, bəla, müsibət, bədbəxtlik. [Sənəm:] *Belə mənim dörd balamın dördünün də xata-balası, azarı tökülsün sənin bircə qardaşının üstünə!* Ə.Haqverdiyev.

◊ **Xata-baladan uzaq qalmaq (olmaq)** – xatalı, təhlükəli bir işdən, hadisədən uzaqda qalmaq, salamat qalmaq. *Arxada, yaxşı bir vəzifədə xata-baladan uzaq qalmaq ona*

*qismət olmamışdı.* Ə.Əbülhəsən. **Xata-baladan uzaq olasan!** – birinə salamatlıq arzusu bildirən ifadə.

**XATA-BALAÇI** *is.* Xata törədən, başqasına əziyyət verən; şuluq, nadinc. *Çox xata-balaçı uşaqdır.*

**XATA-BALALI** *sif.* 1. Təhlükəli, xətərli, xatalı, qorxulu, xata ilə bağlı olan. *Xata-balalı iş. – Çayqıraqlılar ağır və məşəqqətli güzəranlarına görə bu xata-balalı qazancdan əl çəkməyə məcburdular.* Ə.Əbülhəsən.

2. *məc.* Ağır, məşəqqətli, əziyyətli, müsibətli, bəlalı. *Xata-balalı günlər.*

**XATAKAR** *sif.* [*ər.* xəta və *fars.* ...kar] Gözlənilmədən xata törədən, xata törədə bilən, əlindən xata gələ bilən, zərərli, qorxulu, xain. *Xatakar adam. – Kürən at xatakar* (z.) *olar ha.. – deyə, Nadir nəyə isə eyham atdı.* B.Talıblı. // *məc.* Qorxulu, təhlükəli, xətərli. [Fatehzadə:] *Xatakar yerdir. Sualtı qaya o qədər çoxdur ki, orada balaca qayıqla da üzmək olmur.* M.Süleymanov. // İs. mənasında. *Məni bu xatakarın əlindən qurtar.*

**XATAKARLIQ** *is.* Xatalı, təhlükəli iş, pis əməl, başqalarına zərər verən işlər. *Uzun çəkməz, kərbəlayı, yox olar aramızdan şərarət, xatakarlıq; əmələ gələr insaniyyət, elm, tərbiyət, rəhm, insaf!..* N.Vəzirov. [Səməd:] *Yox, bacıoğlu, dinc atdır. Heç xatakarlıq bilməz. Dinc adamın atı da dinc olar.* B.Talıblı.

**XATAKÜN** *sif.* [*ər.* xəta və *fars.* kün] b a x **xatakar**. [İbrahim bəy:] *Bir Kərbəlayı Qulam var, əlləm-qəlləm, xatakün, nadürüst, hacını yaman dolaşdırıb.* N.Vəzirov. [Yarməmməd Salmana:] *Kimin olacaq, dostun Şirzadın! Belə xatakün hələ dünyavü aləmə gəlməyib.* M.İbrahimov. // İs. mənasında. [Zinət xanım:] *O xatakünlərdən xata əskik deyil, mən qorxuram.* N.Vəzirov.

**XATALI** *sif.* Xata gətirən, qorxu törədən, təhlükəli, xətərli, nəticəsi qorxulu. *Xatalı yer. Xatalı yol.* – [Sona xanım:] *Ay aman, Heydər bəy, bu iş də xatalı işə bənzəyir.* M.F.Axundzadə. *O, az qala yalvarır, bu xatalı fikirdən onu daşındırmağa səy edirdi.* M.Hüseyn. *Xatalı yuxudur şöhrət yuxusu; Canıma od saldı onun qorxusu.* B.Vahabzadə.

**XATASIZ** *sif.* və *zərf* 1. Qorxusuz, təhlükəsiz, xətərsiz. *Əlbəttə, bu qazanc xatasız, ölüm-itimsiz olmazdı.* Ə.Əbülhəsən.

2. Günahsız, təqsirsiz, nöqsansız. *Xatasız adam olmaz.*

**XATƏM**[1] *is.* [*ər.*] *klas.* 1. Üzük. *Barmağında xatəm, guşində tənə; Gireh-gireh zülfün tökə gərdənə.* M.P.Vaqif. *Barmağında xatəm, belində kəmər; Telində güşvarə, düymə tamam zər.* Q.Zakir.

**XATƏM**[2] *is.* [*ər.*] Sonuncu, axırıncı, ən sonuncu.

◊ **Adəmdən xatəmə** – dünyanın əmələ gəlməsindən bu günə kimi; heç vaxt, heç zaman. *Adəmdən xatəmə görünməmişdi ki, bəy qızı əsnafa verilsin.* Çəmənzəminli. [Molla:] *Adəmdən xatəmə görünməyib ki, bir nəfər rəiyyət oğlu bir xanzadənin üzünə ağ olsun.* P.Makulu.

**XATIN** *is.* Qadın, xanım. *Ağam bir xatın aldı; Davanı satın aldı.* (Ata. sözü). [Qazan xan:] *A üzü qaralı, başı qadalı, xatınları, oğul-uşağı nə deyə dustaq etdin?!* M.Rzaquluzadə.

**XATINBARMAĞI** b a x **xatını**.

**XATINI** *is.* İri giləli, şirəli üzüm növü. *Baba isə xatını, .. əsgəri, mövücü üzümləri dərib gətirər, tapdalayar və şirə yığardı.* H.Sarabski.

**XATIRLADILMA** 1. "Xatırladılmaq"dan *f.is.*

2. Xəbərdarlıq edilmə, məzəmmətləndirilmə; xəbərdarlıq. *Guya Zeynal vəzifəsinə çox soyuq baxır, dəfələrlə özünə xatırladılmasına baxmayaraq, səhlənkarlıqdan qalmırmış.* S.Hüseyn.

**XATIRLADILMAQ** *məch.* 1. Xatirə salınmaq, yada salınmaq.

2. Xəbərdarlıq edilmək, məzəmmətləndirilmək.

**XATIRLAMA** "Xatırlamaq"dan *f.is.*

**XATIRLAMAQ** *f.* Yada salmaq, xatirinə gətirmək, yad etmək, anmaq. [Student] *birdən-birə ev sahiblərinin qonaq otağında bir dolab kitab olduğunu xatırladı.* Çəmənzəminli. *Kim məni xatırlasa; Çıxaraq sahillərə; Mavi Xəzərə baxsın.* N.Xəzri. *Azad öz uşaqlıq illərini xatırlayırdı.* M.Rzaquluzadə.

**XATIRLANMA** "Xatırlanmaq"dan *f.is.*

**XATIRLANMAQ** *məch.* Yada salınmaq, xatirə gətirilmək, anılmaq, yad edilmək.

**XATIRLATMA** "Xatırlatmaq"dan *f.is.*

**XATIRLATMAQ** *f.* Yadına salmaq. *Bu xoş ətir nədənsə Mehribana nənəsini xatırlatdı.* H.Seyidbəyli. *Bəs nədəndir səni mənə xatırladır; Susuz yanan hər çöl, hər düz?* N.Rəfibəyli. // Andırmaq, oxşamaq, yadına salmaq (oxşar bir şeyi). *Axşamüstü Arazdan qalxan sazaq quru qarğı və qamışları tərpədir, səhərki səsləri büsbütün unudan və qəmli bir hüznü xatırladan başqa bir səs eşidilməyə başlayır*(*dı*). Ə.Vəliyev.

**XATİMƏ** *is.* [*ər.*] 1. Son, axır. ☐ **Xatimə çəkilmək** – son qoyulmaq, bitirilmək. [Şükür] *hökumət kabinəsinin süqutilə bütün narəva hallara bir xatimə çəkiləcəyinə inanırdı.* S.Hüseyn. **Xatimə çəkmək** – son qoymaq, tamamlamaq, bitirmək. *Səfərə çıxmaq həvəsinə xatimə çəkdim.* **Xatimə vermək** – bitirmək, tamamlamaq, nöqtə qoymaq. [Qoca Sərdara:] *Mən istəyirəm ki, iş uzanmasın, biz* [düşmənin] *işinə xatimə verək.* P.Makulu.

2. Kitabın axırına əlavə olunan və əksərən onun xülasə və nəticəsini təşkil edən hissə. *Nizaminin mükafat aldığı kəndin nəhayət dərəcədə dəyərsiz olduğunu kitaba yazılmış xatimədən də anlamaq olur.* M.S.Ordubadi.

**XATİR** *is.* [*ər.*] 1. İnsanın keçmişdə olmuş bir şeyi yadda saxlama qabiliyyəti; yaddaş, zehin. *O əhvalat indi də xatirimdədir. – Xatirində varmı boranlı çağlar? Bürümüşdü bizi zalım qaçaqlar.* M.Müşfiq. ☐ **Xatirə düşmək (gəlmək)** – yada düşmək, hafizədə, yaddaşda yenidən canlanmaq. *Düşəndə xatirimə göylərə çıxar ahim; O mahparə ilə xəlvət etdiyim gecələr.* S.Ə.Şirvani. **Xatirə gətirmək** – yada salmaq, anmaq. **Xatirində qalmaq (yaşamaq)** – yadında qalmaq, unutmamaq. *O gün bizim xatirimizdə əbədi olaraq yaşayacaqdır.* M.İbrahimov. *Beləliklə, mən tam üç gün Yaqutu görmədim və bu üç gün həyatımın ən uzun günləri olaraq həmişəlik xatirimdə qaldı.* Ə.Məmmədxanlı. **Xatirində saxlamaq** – yadından çıxarmamaq, unutmamaq. **Xatirindən çıxmaq** – yaddaşdan çıxmaq, unutmaq. *Ürəyim təngləşirdi.* "*Adi həyat*" *bildiyimiz şəhər yaşayışı, şəhərin yuxusuz gecələri xatirimdən çıxmırdı.* T.Ş.Simurq.

2. *məc.* Könül, ürək, qəlb mənasında. *Ey fəqir, ehtiyacını göstər! İstə məndən, nə xatirin istər!* M.Ə.Sabir. [Almaz Aftilə:] *Sən bilirsən ki, mən sənin xatirini nə qədər istəyirəm.* C.Cabbarlı. // *məc.* Mənlik hissi. ☐ **Xatirinə dəymək (toxunmaq)** – mənliyinə, izzəti-nəfsinə toxunmaq. *Bu söz Kazımın xatirinə dəyən kimi oldu.* Mir Cəlal. *..Xatirinə dəyməmək üçün Eldara heç bir söz demirdim.* M.Rzaquluzadə.

3. Hörmət, sayğı. *Sənin xatirin üçün. O, xatir bilən deyil.* ☐ **Xatir saxlamaq** – hörmət saxlamaq, sayğı bəsləmək.

4. **Xatirinə** şəklində – 1) hörmət, sayğı əlaməti olaraq. *Mənə elə gəlir dünyada hər şey; Sənin xatirinə yaranıb ancaq.* Ə.Kürçaylı. *Professorun iştahı güc gətirsə də, Ədhəmin xatirinə özünü saxlaya bildi.* B.Bayramov; 2) ...naminə, ...üçün, ...görə, ...uğrunda. *İndi mən sabahın xatirinə; Onların bu gününü alımmı əllərindən?.. Almalıyam... çarə yox!* B.Vahabzadə.

◊ **Xatiri qalmaq** – bir şeydən incimək, könlünə toxunmaq, məyus olmaq, ürəyi incimək. **Xatiri olmaq** – hörməti olmaq, nüfuzu olmaq, sayılmaq, istənilmək, əzizlənmək. **Xatiri ... yanında əziz olmaq** – hörmət edilmək, əzizlənmək, sayılmaq. *..Vətənə qulluq edən qadının xatiri hamının yanında əzizdir.* Mir Cəlal. *Hələ indi, bu qocalıq günlərində Gülzar xalanın xatiri Mustafa kişinin yanında o qədər əzizdi ki..* M.Əlizadə. **Xatirini almaq** – könlünü almaq, təskin etmək, ürək-dirək vermək. *Taybuynuz öküzə heç mahnı oxuyan, xoş dillə onu oxşayan və xatirini alan olmur...* F.Köçərli. **Xatirini gözləmək (saxlamaq)** – hörmətini gözləmək, hörmətini saxlamaq, hörmət etmək, xatirini istəmək. **Xatirini istəmək** – sayğı, hörmət bəsləmək, əziz saymaq, yanında hörməti olmaq. [Mustafa bəy:] *Bilirsən, Mirzə Kərim, mən sənin xatirini çox istəyirəm.* Ə.Haqverdiyev. **Xatirini qırmaq (sındırmaq)** – qəlbinə dəymək, ürəyini sındırmaq. *Lələ Lətifin xatirini sındırmayıb gül bağına getdi.* "Lətif şah". **Allah xati-**

**rinə** – yalvarış, xahiş mənasında: sən Allah, Allah eşqinə. [Rəhim:] *Ağa, Allah xatirinə mənim munisimi əlimdən alma!* N.Vəzirov. [Gövhərin əri camaata:] *Allah xatirinə, hər gün iclas çağırın, bəlkə bu arvadın üzünü az görüm.* M.İbrahimov.

**XATİRAT** *is.* [*ər.* "xatirə" söz. cəmi] Xatirdə, yadda qalan şeylər. // Keçmiş hadisələr haqqında şəxsi xatirələrdən ibarət əsər və s. [Müəllim:] *Sən mənə birgünlük xatiratını yaz, gətir.* Qantəmir. *Bu, Mustafanın xatirat dəftərçəsindən bir vərəqdir.* Mir Cəlal.

**XATİRCƏM** *sif.* və *zərf* [*ər.*] Arxayın, sakit, rahat, asudə. *Xatircəm yaşamaq.* – [Mirzə:] *Balalarım, dünyada mən çox ömür etmişəm, sizin yolunuzda nə qədər çalışıb məramıma çatmışam və xatircəm, qeydsiz dünyadan gedirəm.* Ə.Haqverdiyev. *Şahsənəm çolpa-cücələrini qanadının altına alıb, xatircəm yatmışdı.* S.M.Qənizadə. ◻ **Xatircəm etmək** – arxayın etmək, sakitləşdirmək. *Kosa klub müdirini xatircəm edib geri qaytardı.* S.Rəhimov. **Xatircəm olmaq** – rahat olmaq, arxayın olmaq, sakit olmaq. [Əhməd:] *Qızım, mənim nə oğlum var, nə də qızım, səni sınayırdım, xatircəm ol, Qəribini tapıb sənə yetirərəm.* "Aşıq Qərib". *Şah övrət-uşağı tərəfindən xatircəm oldu.* M.F.Axundzadə. [İsmət:] *Getmiş, mollanı bulsun; Məktubu oxutsun, xatircəm olsun.* H.Cavid.

**XATİRCƏMLİK** *is.* Arxayınlıq; həyəcan, iztirab, narahatlıq, inamsızlıq olmadığı hal; işin tam uğur və müvəffəqiyyətlə nəticələnəcəyinə arxayın olma. ◻ **Xatircəmlik vermək** – arxayınlıq vermək, arxayın etmək, xatircəm etmək, nigarançılıqdan qurtarmaq, əmin etmək. *Hərgah siz məni bir yerə işə qoymaq istəyirsiniz, hər barədə xatircəmlik verə bilərsiniz.* M.S.Ordubadi.

**XATİRCƏMLİKLƏ** *zərf* Xatircəm halda, rahat-rahat, narahat olmadan, arxayın halda. *Yədullah xan xatircəmliklə çaparı yola saldı.* S.Rəhimov. *..Ağasəfər gördüyü pis yuxunu yadından çıxarmağa çalışıb, buna müvəffəq olan adamlara məxsus arxayınlıq və xatircəmliklə yenə də gözlərini ətrafa dolandırdı.* Ə.Əbülhəsən. *Vahid də bu gün xoş bir xatircəmliklə, məmnunluqla evə qayıtdı.* Mir Cəlal.

**XATİRƏ** *is.* 1. İnsanın yadında, hafizəsində qoruyub saxladığı hər hansı bir hadisə, iş və s., keçmişdə olmuş hər hansı bir hadisəni, işi və s.-ni xatırladan şey. *Kənd həyatında təbiətin o zəngin və geniş qucağında nə qədər canlı lövhələr, unudulmaz xatirələr vardır.* A.Şaiq. ◻ **Xatirədən silinmək** – unudulmaq, yaddan çıxmaq. **Xatirədən silmək** – unutmaq, zehnindən çıxarmaq, həmişəlik olaraq yaddan çıxarmaq.

2. Bir adam və ya hadisə haqqında yadda qalan şey. *Nə isə, Məsmənin yeganə, əziz oğlu haqqında şirin xatirələri tükənməz idi.* Mir Cəlal. *Qızdan yalnız xoş bir xatirə qalmışdı.* S.Vəliyev. // Bir şeydən xatirə qalan, onu xatırladan hadisə və s. haqqında. *Bu kitab atamdan qalma xatirədir.*

3. Cəm şəklində: **xatirələr** – b a x **xatirat**. *Ədəbi xatirələr.* "*Xatirələr*"*ini çap etdirmək.*

4. Yadigar mənasında. *Səndən mənə bir ömürlük xatirə; Məndən sənə nə qalacaq, nə bilim?* M.Araz. // Yaddaş üçün olan. *Bu dəftər, anladığımıza görə, ya müşahidə və xatirə və yainki bir səyahət dəftəri olmalı idi.* T.Ş.Simurq. *Quşqonmazın başında; Bir qayanın qaşında; Üstü zərlə yazılmış; Xatirə lövhəsi var.* H.Abbaszadə.

**XATUN** b a x **xatın**. *İtirilən gənclik üçün artıq həsəd və qısqanclıq xanla xatunu qəribə bir təbə salırdı.* S.Rəhimov. // b a x **xanım** 4-cü mənada. *Atabəy verdiyi əmr üzərinə Qətibə xatun məcburi olaraq Köşkbaği-müəzzəmdə düşüb qalmışdı.* M.S.Ordubadi. *Bütün xalqın gözü Girdmanın anası Cavahir xatuna zilləndi.* M.Hüseyn.

**XAVƏRAN** *is.* [*fars.*] Klassik Şərq muğamlarından birinin adı.

**XAY** *is.* Dənizdə, göldə, çayda tam sakitlik, sakit hava, küləksizlik. *Hava xoş, dəniz xay, əncir-üzüm bol; Dənizdə oğlanlar, qızlar çimirlər.* R.Rza. // Sif. mənasında. *Əsəbləri sığallayır bu xoş hava, bu xay hava; Gözəlliklər ağuşunda nəfəs alır bu yurd-yuva.* S.Rüstəm. *Suyun xay səthində cənub günəşinin yandırıcı şüaları göz qamaşdırırdı.* Ə.Əbülhəsən.

**XAYA** *is.* [*fars.*] *anat.* Erkəklik vəzilərinin yerləşdiyi kisəcik. // Erkəklik vəziləri.

**XAYIR** bax **xeyr** 1-ci mənada. [Səlma:] *Neçin o indi olsun böylə qafil? Xayır, xayır, oğlum vəfasız deyil.* H.Cavid. *Xayır! Məhəbbətin gözü kor olur; Onda nə ehtiyat, nə imtahan var!* S.Vurğun.

**XE** "X" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**XEYİR** *is.* [*ər.*] 1. Fayda, mənfəət. *Bağın, əkinin xeyrini bəylər görəcəkmiş; Toxm əkməyə dehqanları neylərdin, ilahi?!* M.Ə.Sabir. *Atalar, babalar əkiblər, tər töküb becəriblər, xeyrini biz görürük.* Mir Cəlal. □ **Xeyir dəymək (gəlmək)** – faydası olmaq, xeyri olmaq. *Axı, düzünü bilsəm, bundan mənə xeyir gələr ki, ziyan gəlməz.* M.Hüseyn. [Qoşqar:] *Soyuqqanlı fikir mübadiləsi olmayan yerdə heç vaxt ümumi işə xeyir dəyməz, yoldaş Əmirli.* İ.Hüseynov. **Xeyir eləmək** – bax **xeyir görmək**. *Eşqin məni gündən-günə qeyr elər; Səni sevən, əlbəttə ki, xeyr elər.* M.V.Vidadi. **Xeyir gətirməmək** – heç bir xeyri olmamaq, ziyan vermək, zərəri olmaq. [Rəhim xan Sitarəyə:] *Dilin çox itidir. Hər halda ziyandan başqa sənə bir xeyir gətirməz.* C.Cabbarlı. **Xeyir görmək** – mənfəət götürmək, xeyri olmaq, faydalanmaq. [Hacı Əhməd Almaza:] *Biz dedik ki, biz də rahat qalaq, sən də bu kənddən xeyir görəsən.* C.Cabbarlı. [Pərinin əri:] *Qızı nə qədər tez ərə versən, bir o qədər xeyir görərsən, canın rahat olar.* Ə.Vəliyev. **Xeyir vermək** – mənfəət vermək, fayda vermək. [Qurban:] *Molla, mənə bir məktub yaz. Bilirsən ki, hər il sənə nə qədər xeyir verirəm.* A.Şaiq. *Biz hələ bundan sonra çalışıb insanlara xeyir verə bilərik.* M.Hüseyn. **Xeyri qalmamaq** – daha heç bir faydası olmamaq, artıq işə yaramamaq, işlənməz, yararsız hala gəlmək. **Xeyri yox** – artıq işə yaramır, faydasızdır. *Sığallı, səksəkəli, sətirləri ləkəli; yüz eyhamlı, kölgəli; tənqidin həm şairə, həm də onu yazana; vallah, bir xeyri yoxdur.* R.Rza. **Öz xeyrini güdmək** – ancaq öz mənafeyi üçün çalışmaq. *Dövlətlilər ancaq öz xeyirlərini güdürdülər.* Ə.Sadıq. // Qazanc, fayda. [Hacı Qara:] *..Yüz manat xeyir hardan yetişəcək? Bu xeyri yetirən kimdir?* M.F.Axundzadə.

2. Yaxşılıq, yaxşı iş. □ **Xeyir iş görmək** – yaxşılıq eləmək.

◊ **Xeyir xəbər** – xoş xəbər, ürəkaçan xəbər, yaxşı xəbər, sevindirici xəbər. [Hacı Kamyab:] *Çox mübarək və böyük səadətdir. Bu saat gedim bu xeyir xəbəri qızın anasına da yetirim. Mürəxxəs olum.* Ə.Haqverdiyev. **Xeyir iş** – 1) evlənmə, nikah, toy, nişan, düyün. [Əfifə:] *Zəhmət haqqı olmasa da, mən bu vəzifəni bitirə bilərəm. Madam ki, xanımın xeyir işi vardır, haman xeyir işdə iştirak etmək lazımdır.* M.S.Ordubadi; 2) faydalı, sevindirici. *Bir kəndin ki koxası Mürşüd ola, heç olar ki, orada xeyir iş ola?* (Ata. sözü). *Qəzetləri də bir-birinə vurdum, heç bir yerdə Sultan tərəfindən bir xeyir iş baş verdiyini görmədim.* C.Məmmədquluzadə. **Xeyir ola? Xeyir olsun? Xeyir xəbər ola?** – heyrət, maraq, təəccüb məqamında işlənən sual ifadəsi. [Asya:] *..Görəsən bu bizə nəyə gəlir, xeyir xəbər ola?..* Ü.Hacıbəyov. *Usta Zeynal xəbər aldı: – A mirzə, gözümə bikef dəyirsən, nə olub, xeyir ola?* Ə.Haqverdiyev. **Xeyrini görəsən!** – yeni alınan, əldə edilən şey haqqında xoş arzu bildirir (bəzən istehza yolu ilə deyilir). **Xeyrini görmək** – istifadə etmək, faydalanmaq. **Axşamın (sabahın) xeyir!** – səhər (axşam) görüşüb salamlaşdıqda işlənən ifadə. *Sabahınız xeyir, Səmirə xanım!* M.Hüseyn. **Allah xeyrə calasın! Allah xeyir versin!** – xoş arzu, uğur arzusu bildirən ifadə. [Cahan:] *Nə deyirəm, Allah xeyir versin!* Ü.Hacıbəyov. [Məşədi Səfdər:] *Arvad, Allah xeyrə calasın, bu genə nə qırmızı kəsim-biçimdir?* M.Əliyev. **Başıma xeyir!** – təəccüb, heyrət ifadəsi. *Boy, başıma xeyir, buna bax, buna; Elə bil borcluyam zalım oğluna.* S.Vurğun.

**XEYİR-BƏRƏKƏT** *is.* [*ər.*] Yaşayışda bolluq, firavanlıq, rifah; adamlara xeyir, fayda verən şeylər. *Böyüksüz evdə xeyir-bərəkət olmaz.* (Ata. sözü). [Gülüşgəlin:] *İndicə-indicə evimizə xeyir-bərəkət gəlir.* S.Rəhimov. *Bəylik, göylük, səylik olan məclisdə; Qaç ki, orda xeyir-bərəkət olmaz.* Aşıq Ələsgər.

◊ **Xeyir-bərəkətini qaçırmaq** – qiymətdən salmaq, zərərə salmaq. [Yaşlı kişi tacirə:] *Sən mənim xeyir-bərəkətimi qaçıracaqsan, sən mənim halal malıma haram qatacaqsan... – deyərək, uzun-uzadı deyinərdi.* S.Hüseyn.

**XEYİR-DUA** *is.* [*ər.*] Səadət, xoşbəxtlik, xoşgün, uğur diləyi. *..Qazı əvvəl başladı nəsihəti və xeyir-duasını; sonra nəçərnik özü başlayıb bir xütabə oxudu..* C.Məmmədquluzadə. *Qayınatası da gəlinin üzünə qarşı xeyir-dualar söyləyəcəkdir.* R.Əfəndiyev. *Şəhid rütbəsinə qalxan cavanlar; Sinəsi hər zülmə qalxan cavanlar; Böyük Nəsiminin, ulu Babəkin; Xeyir-duasını aldı o gecə.* B.Vahabzadə. □ **Xeyir-dua vermək (demək, eləmək)** – birinə səadət, xoşbəxtlik arzulamaq, uğurlar diləmək. *Usta Zeynal Mirzə Səfərin oğluna xeyir-dua verib, yaxşı yol ilə müvəffəqiyyət diləyib bir qızıl saat da peşkəş verdi.* Ə.Haqverdiyev. *Hüseynin anası xeyir-dua eləyə-eləyə oğlu ilə bərabər qapıdan çıxdı.* S.Rəhman.

**XEYİR-DUAÇI** *is.* Bir yaxşılığa görə birinə uğur, xoşbəxtlik, səadət diləyən adam, minnətdar. *İyid istərəm ki, yayımı əyə; Bu şeşpərim ola, sinəmə döyə; Xeyir-duaçı ollam, düşərəm önə; Göndər, türkmanlardan xanlarım gəlsin!* "Koroğlu".

**XEYİRXAH** *sif.* [*ər.* xeyir və *fars.* xah] Başqasının və hamının yaxşılığını istəyən, başqalarına kömək edən, yaxşılığa çalışan; qayğıkeş. *Xeyirxah adam.* – [Almaz Xanımnaza:] *Şərif çox yaxşı adam imiş, ana. Mən heç gözləməzdim. İşlək, çalışqan, xeyirxah.* C.Cabbarlı. [Rəşid:] *Qurbanqulu həmişə xalqın xeyirxahı* (is.) *hesab olunardı.* T.Ş.Simurq. [Müvəkkil:] *Siz xeyirxah adamsınız, yoldaş Qaradağlı, bəlkə məsələ qaldırasınız, bulağın üstündə Səməd Vurğunun heykəlini qoyalar.* B.Bayramov.

**XEYİRXAHCASINA** *zərf* Xeyirxahlıqla, xeyirxah adama yaraşan bir tərzdə. *Xeyirxahcasına kömək. Xeyirxahcasına münasibət.*

**XEYİRXAHLIQ** *is.* Başqalarına xeyirxah münasibət; yaxşılığa çalışma; qayğıkeşlik, qeydkeşlik, yaxşılıq, kömək. *Bu sözü mən xeyirxahlıqdan ərz edirəm, qorxuram səni pul üstə o qədər əzələr ki, şişib dama dönəsən, pul ilə zarafat olmaz, canım, gözüm!* N.Vəzirov. [Xavər:] *Bax, adam onun kimi olar. Üzü, gözləri, danışığı, hamısı xeyirxahlıqla doludur.* M.İbrahimov. *Vidadi ədalət və xeyirxahlıq mücəssəməsi kimi hər yerdə, xüsusən Vaqifin çətinliyə düşdüyü yerlərdə, görünür, öz köməyini, hətta canını belə onun yolunda müzayiqə etmir.* M.Arif. □ **Xeyirxahlıq etmək (eləmək, göstərmək)** – yaxşılıq etmək, kömək göstərmək, xeyrə çalışmaq. *Tənbələ, əyriyə xeyirxahlıq etmək yaxşı işləyənin belindən basmaqdır.* M.İbrahimov. [Afərin] *adamlara həmişə xeyirxahlıq etməyi sevirdi.* Q.İlkin.

**XEYİRXƏBƏR** *is.* [*ər.*] Xoş xəbər, ürəkaçan, şad xəbər. *Deyəsən, xeyirxəbərin var.* – [Qadın:] *Sən də gərək Hafizdən bir fal açasan, görək qubernator xeyirxəbər gətirəcəkdimi?* M.S.Ordubadi. // Xeyirxəbər gətirən. *Telli xala bu xeyirxəbər qadının dodaqlarından öpmək istəyirdi.* Mir Cəlal.

◊ **Xeyirxəbər olasan! (olasınız!)** – şad, xoş xəbər gətirən adama razılıq, təşəkkür ifadəsi. [Fatmanisə:] *Ay oğul, sağsağan qırıldayır, çıx gör atan gələcəkdirmi? Deginən: sağsağan, sağsağan, xeyirxəbər olasan. Oğlunun da oğlu olubdur, qızının da oğlu olubdur.* Ə.Haqverdiyev. [Zeynal Leylaya:] *Sizi xeyirxəbər olasınız, doktor!* B.Bayramov.

**XEYİRLƏŞMƏ** "Xeyirləşmək"dən *f.is.*

**XEYİRLƏŞMƏK** *f.* Sövdəni, alver razılığını bir-birinin əlini tutmaqla kəsmək, bitirmək, sövdələşməni həll etmək.

**XEYİRLİ** *sif.* Xeyir verən, xeyri olan; gəlirli, qazanclı, əlverişli. *Xeyirli iş. Xeyirli sənət.* – [Keçəl:] *Lotubaşı, sən qovunu ver, mən sənə bir xeyirli yer deyim.* "Aşıq Qərib". *Qonşum elə güman eləyib ki, dünyada yazıçılıqdan asan, yazıçılıqdan xeyirli peşə yoxdur.* S.Rüstəm. // Faydalı, xeyirli, əlverişli, xeyir verən. *Xeyirli şərait. Xeyirli məsləhət. Ancaq məndən soruşsan, çətin olsa da, inan; İnsan olmaq yaxşıdır, adi, xeyirli insan!* R.Rza. // Cana, səhhətə xeyri, faydası olan. *Badamlı çox xeyirli sudur. Xeyirli dərman.* – [Qaçay Sevincə:] *Son günlər yaman xeyirli sözlər danışırsan.* Z.Xəlil. // Bərəkətli, bol, xeyir-bərəkətli. *Bütün ellər xeyirli; Varlı aranda qaldı; Vaz keçib*

*dağdan-daşdan; Yer tutdu, yuva saldı.* Ə.Cavad.

**XEYİRLİK** *is.* Yaxşılıq, yaxşı iş, xeyir iş, xeyirliyə olan iş (toy, bayram və s.). *Xeyirliyə gəlmək. Xeyirliyə çalışmaq. Təzə evdə ilk süfrə xeyirliyə açılmışdı.*

◊ **Ağzını xeyirliyə açmaq** – b a x **ağzını xeyrə açmaq** ("**ağız**[1]"da). **Xeyirliyə deyil!** – nəticəsi yaxşı qurtarmayacaq iş, hərəkət və s. haqqında. *Belə adamın gecə vaxtı yuxarı qalxması xeyirliyə deyildi.* S.Vəliyev.

**XEYİRLİLİK** *is.* Xeyir vermə; mənfəətlilik, gəlirlilik, qazanclılıq. *Peşənin xeyirliliyi. İşin xeyirliliyi.* // Faydalılıq, fayda vermə qabiliyyəti; yaxşı təsir. *Dərmanların xeyirliliyi. Mədən sularının səhhətə xeyirliliyi.*

**XEYİRSİZ** *sif.* Heç kəsə xeyri, yaxşılığı toxunmayan, xeyir verməyən. *Xeyirsiz adam. – Mən hərdən oturub fikirləşirəm və bu əqidəyə gəlirəm ki, bizim çoxumuzu bədbəxt edən karsız, vecsiz və xeyirsiz qohumlarımızdır.* Ə.Vəliyev. *Hamı arsız və xeyirsiz, gücü az; Amma xəncərlə bıçaq vurmağa saz.* Şəhriyar. // Faydasız, faydası, xeyri olmayan, nəticəsiz. *Xeyirsiz iş. Xeyirsiz peşə.*

**XEYİRSİZLİK** *is.* Heç bir xeyir, fayda verməmə, heç bir xeyri, faydası olmama, faydasızlıq, nəticəsizlik.

**XEYİRSÖYLƏMƏZ** *sif.* Ağzını pisliyə açan, ağzına heç bir xeyir söz, xeyirxahlıq gəlməyən, nəhs danışan. *Vardı bir xeyirsöyləməz nadan; Dilinə xeyir gəlməyib bir an.* S.Ə.Şirvani. *– E-e-e! – deyə, Əhməd qəzəblə qışqırdı, – belə də xeyirsöyləməz adam olar?* M.Süleymanov.

**XEYİR-ŞƏR** *is.* [*ər.*] Toy və ya yas, şadlıq və ya kədər olan yer və bunlarla əlaqədar işlər, mərasim. *Xeyir-şərdə iştirak etmək. Xeyir-şər məclisində olmaq. – Yasda, toyda, hamamda, məsciddə, müxtəsər "hər yanda aşdı, orada başdı", xeyir-şər Tükəzbansız keçməzdi.* B.Talıblı. [Zeynal:] *Hansı tacirin evində xeyir-şər olanda Nisə arvadı çağırmayıblar?* Ə.Əbülhəsən. [Müəllim] *tək uşaqlara savad öyrətməklə kifayətlənmirdi, kəndin bütün xeyir-şər işlərinə də qarışırdı.* S.Qədirzadə.

◊ **(Öz) xeyir-şərini bilmək (anlamaq, qanmaq)** – özünə nəyin xeyirli və nəyin zərərli olduğunu bilmək, başa düşmək, anlamaq, ona müvafiq də hərəkət etmək. *Çox da nadan deyiləm, anlamayım xeyrü şərim.* S.Ə.Şirvani. *Xeyrü şərin qan, oğlum! Öz halına yan, oğlum!* A.Səhhət. [Rəsul:] *Vaxtında bu qoyun kimi camaat xeyir-şərini gözəlcə anlayacaq.* Ə.Haqverdiyev. **Xeyrə-şərə yarayan** – həm xeyir işdə, həm də yasda adamlara yaxından kömək edən. *Bu adam xeyrə-şərə yarayan deyil, – "Şahsənəm xala" deyilən aralıq arvadı idi, xeyrə-şərə yarayan idi, hamının dərdi-dilinə yetişən* (*idi*)... E.Sultanov. **Xeyrə-şərə yaramayan (yaramaz)** – xeyirdə-şərdə iştirak etməyən, başqalarının dərdinə, qəminə yetişməyən, laqeyd, yararsız, bacarıqsız adam haqqında. *Xeyrə-şərə yaramaz oğul. – Bikef İbad xeyrə-şərə yaramayan, fərdi həyat sürən bir adamdı.* Çəmənzəminli. [Rüstəm Səkinəyə:] *Axı adət var. Qaytararsan, dalınca min söz deyərlər. Adın qalar xeyrə-şərə yaramaz.* M.İbrahimov. *Sərhəd boyunda Şöklü Məlik deyilən xeyrə-şərə yaramaz, kimsəyə yovuşmaz qəribə xasiyyətli qərib bir bəy yaşayırdı.* M.Rzaquluzadə.

**XEYLAQ** *dan.* "Xeyli" sözünün canlı dildə işlənən forması. *Xeylaq adam. Xeylaq mal. Xeylaq iş görmək. – Bahadır dəftərçəsinə xeylaq yazandan sonra meşədə gəzirdi.* N.Nərimanov.

**XEYLİ** *sif.* və *zərf* Olduqca çox, çoxlu, bir çox. *Xeyli adam gəlmişdi. Xeyli kitabı var. O hadisədən xeyli zaman keçmişdir.* – [Şah:] *Öylə isə, sən bizə bir ay möhlət ver, bir yol ilə sənə xeyli pul qazandıraram.* Ü.Hacıbəyov. // Olduqca, son dərəcə. *Onun halı xeyli pərişan idi. – Bu suallar məni xeyli təəccübləndirdi.* A.Divanbəyoğlu. □ **Bir xeyli** – 1) uzunuzadı. *Söhbət davam edir bir xeyli... Leyla; "Daha yetər", – deyə qalxır yerindən.* B.Vahabzadə; 2) çoxlu, külli miqdarda. [Dürrənin] *ətrafına bir xeyli arvad toplanmışdı.* S.Vəliyev.

**XEYLİCƏ** *sif.* və *zərf* Olduqca çox, çoxlu, külli miqdarda. *Xeylicə pulu var. Xeylicə kitabı var.* // Adi qaydadan çox, bir qədər artıq. *Xeylicə gəzdik. Xeylicə söhbətləşdik. – Axşam küləyi qalxar, əsər xeylicə yüngül; Gül ətrini duyduqca ötər şövqlə bülbül.* A.Səhhət.

**XEYMƏ** *is.* [*ər.*] Çadır. *Ey baba bəy, bu humayun əsgərin; Seşənbədə sərmənzili Car oldu. Məşriq tərəfində tazə qələnin; Qurulub xeymələr bərqərar oldu.* Q.Zakir. *Ki, nagəh xeymə dalından bir övrət; Dedi ey hatəm, ey şahi-səxavət! Uşaqlarım qalıbdır bu gecə ac; Olub bir löqməyə məğmunu möhtac.* S.Ə.Şirvani. *Bəzən də yaşamaq həvəsilə tək; Bir insan ətrafa qılınc çəkərək; Bütün bir ordunu heyrətə salmış; Xeymələr dağıdıb, çadırlar almış.* S.Vurğun.

**XEYMƏGAH** *is.* [*ər.* xeymə və *fars.* ...gah] Xeymələr (çadırlar) qurulmuş yer, düşərgə. *İslam tarixinə daxil olmuş o qara xeyməgah artıq il yarım idi ki, nəhəng bir qara quş kimi mənzil-mənzil qonaraq Məğribdən-Məşriqə doğru hərəkət edirdi..* Ə.Məmmədxanlı.

**XEYR** *əd.* [*ər.*] Bir şeylə razı olmadıqda və ya verilən suala mənfi cavab üçün işlənir. *Suallarla razısan? – Xeyr. Gəzmək istəyirsən? – Xeyr. Gələcəksənmi? – Xeyr. – Eldarı hələ unutmamışsınızmı? – Xeyr, unutmamışam.* S.Hüseyn. [Vaqif:] *Xeyr, yanıldınız, ona dil verən; Gözilə dünyada alovlar görən; Kəndistan yeridir, bəli, kəndistan!* S.Vurğun. // Ümumiyyətlə, etiraz, narazılıq bildirir (bəzən təkrar şəklində). *Xeyr, xeyr, – deyə qışqırdı. Xeyr, xeyr, razı deyiləm.* – [Hacı Baxşəli:] *Xeyr, Hacı Həsən ağa, qoy şeyx cənabları bizdə qonaq olsun.* C.Məmmədquluzadə. [Sultan:] *Xeyr, şəxs ola bilər ki, çox elm oxumuş olsun və tərbiyəsi az olsun.* N.Nərimanov. // İnkar mənasında işlənir. *– Xeyr, gözəl deyil, çirkindir. Xeyr, çox uşaqdır hələ.* – [Həsən bəy:] *Cavanlığı? Xeyr, Məşədi İbad qocadır. Bəs nəyi? ..Məşədi İbadın pulu, malı, dövləti?* Ü.Hacıbəyov. *Ondan uzaqlarda bir səyyarə var; Xeyr, səyyarə yox, bir təyyarə var.* M.Rahim.

**XEYRAT** *is.* [*ər.*] *din.* Ölmüş adamın xatirəsinə verilən yemək; ehsan. *Dedi ki, mən edən zamanda vəfat; Dəfn edin, verməyin mənə xeyrat.* S.Ə.Şirvani. *..Elə bunu götürək ki, bu axır vaxtlarda başlayıbsınız nuxalılara dəlil və nəsihət eləməyə ki, çaxır içib keyflənməsinlər və palaz-paltarlarını satıb xeyrat verməsinlər.* “Mol. Nəsr.” // Savab üçün verilən pul, yemək və s., habelə savab üçün edilən işlər. *Xeyrat paylamaq. – Günlərin bir günündə bir molla Coratdan Türkana xeyrat yeməyə gedirdi.* (Nağıl). *Halvanın və xeyrat plovlarının savabını və lazım olmadığını dananlar kafir və mürtəddirlər..* Ə.Haqverdiyev.

**XEYRƏ** *is.* Misdən, alüminiumdan, saxsıdan və s.-dən qayrılan dəyirmi, dərin qab. *Əti xeyrədə yumaq. Meyvəni xeyrəyə qoymaq.*

**XEYRİ, XEYRİGÜLÜ** *is.* Qırmızı rəngli, topləçəkli gül; məxmərgülü. *Xiyabanın hər iki tərəfini yeni açılmaqda olan xeyri, şəbbu, qırmızı zanbaq və sair rəngarəng çiçəklər bürümüş idi.* M.S.Ordubadi.

**XEYRİYYƏ** *sif.* [*ər.*] Xeyir iş, ehtiyacı olanlara kömək, yardım məqsədini güdən. ☐ **Xeyriyyə cəmiyyəti** – 1920-ci il inqilabından əvvəl maarif, səhiyyə, mədəniyyət və s.-ni inkişaf etdirmək məqsədi ilə camaatdan pul toplayan cəmiyyət. [Mirzə Qədir] *..milli mətbuatda ara-sıra nəşr etdiyi məqalələri ilə, xeyriyyə və maarif cəmiyyətindəki fəaliyyəti ilə .. şöhrət və nüfuz qazanmışdı.* S.Hüseyn.

**XEYRİYYƏÇİ** *is.* Xeyriyyə cəmiyyətinin işində iştirak edən, xeyriyyə cəmiyyətinin üzvü.

**XƏBƏR** *is.* [*ər.*] 1. Bir iş, hadisə və s. haqqında məlumat. *Nə lazım olmuşdu ki, belə dəhşətli xəbəri şaha verib bu qalmaqala səbəb ola və özünü dəxi həlakətə sala?* M.F.Axundzadə. *Bu yavuqlarda bizim sahibmənsəblərdən birisinin ölüm xəbərini qəzetlərdə oxuduq.* C.Məmmədquluzadə. [Ağayar] “*Bakıdan komissiya gəlib*” *xəbərini eşidincə, çox dilxor oldu.* Ə.Əbülhəsən. ☐ **Xəbər almaq** – soruşmaq, bilmək, istəmək. *Məsələni xəbər almaq. İşi xəbər almaq. – Xəbər alsa səndən: o binəvanın; Necə keçir ruzigarı görəsən; Söylə ki, göz yolda, könül intizar; Şəm tək oturub sübhədək ağlar.* Q.Zakir. [Axundov:] *Canım, qız bir yasin surəsini bildi, bəsdir, kifayətdir və oğlana da lazım olan məsələləri gəlib mənim kimi axundlardan xəbər alar, vəssalam.* C.Cabbarlı. **Xəbər çıxmaq** – bir hadisə və s. haqqında söz eşidilmək, şayiə çıxmaq (yayılmaq). **Xəbər çıxmamaq** – getmiş, yaxud yoxa çıxmış bir adamdan, ya da gözlənilən bir işdən heç bir soraq gəlməmək,

heç bir xəbər eşidilməmək. [Uşaqların] *..atalarından bir xəbər çıxmadı.* S.S.Axundov. **Xəbər eləmək** – bildirmək, xəbərdar etmək. *Gələcək nəslə şerim bu gündən; Hay vurub, qıy vurub, xəbər eyləsin.* M.Rahim. **Xəbər gəlmək** – söz eşidilmək, məlumat gəlmək. *Ta ki xəbər gəldi xublar şuxundan; Əl çəkdim cahanın varü yoxundan.* M.V.Vidadi. **Xəbər gətirmək** – gördüyü və ya eşitdiyi bir şey haqqında məlumat vermək, bildirmək. *Bələdçinin biri xəbər gətirdi ki, məftil hasarın bir kilometrliyini düşmən minalamışdır.* Ə.Vəliyev. *Səhər Səriyyə xəbər gətirdi ki, kəndə yaman küy düşüb.* İ.Əfəndiyev. **Xəbər tutmaq** – soruşub bilmək, məlumat almaq, məlumat əldə etmək, xəbərdar olmaq. *Biz cəbhənin vəziyyətindən xəbər tuturduq.* M.S.Ordubadi. [Fərhad Nazlıya:] *Sən də buradasanmış, Nazlıcan, yenə Mustafa ilə mənim görüşümdən xəbər tutmusan?* Ə.Məmmədxanlı. **Xəbər vermək** – məlumat vermək, bildirmək, xəbərdar etmək, çatdırmaq. *Lalə tək daği-dili-sineyi-suzanımı gör; Ver xəbər dilbəri-süsənbərə, ey badi-səba.* S.Ə.Şirvani. *Kətxuda Bayramı tutub dama salmaq, elə gecə ikən şəhərə çapar yollayıb rəisə xəbər vermək istədi.* M.Hüseyn. *Ancaq qorxdu ki, onlar bunu başqalarına xəbər verərlər.* M.Rzaquluzadə. **Xəbər yayılmaq** – şayiə yayılmaq, söz yayılmaq. *Lakin çox çəkmədi ki, elə bil bütün quşlara xəbər yayıldı.* Ə.Məmmədxanlı. **...xəbəri gəlmək** – 1) haqqında məlumat gəlmək, nəticəsi bilinmək, sorağı gəlmək. *Məktubun xəbəri hələ də gəlməyib;* 2) birinin ölümü haqqında məlumat, xəbər gəlmək. *Ölüm xəbəri gəlmək.*

2. Məlumat, bilik, vaqiflik. *Onun elmdən heç xəbəri yoxdur. Bu işdən xəbərim yoxdur.*

3. *qram.* Mübtəda ilə ifadə olunan əşyanın əlamətini göstərən cümlənin iki baş üzvündən biri.

4. Yalnız cəm şəklində: **xəbərlər** – vaxtaşırı nəşr edilən bəzi məcmuələrin adı. "*Azərbaycan Elmlər Akademiyasının Xəbərləri*".

**XƏBƏRÇİ** *is.* 1. Xəbər gətirən, müjdəçi. *Bu əsnada xəbərçi gəlir, qeyrətkeş arvad mətanəti-qəlb ilə ondan təvəqqe edir ki, heç bir şeyi gizlətməyib, ona dürüst xəbər versin.* F.Köçərli.

2. Xəbərçilik edən, xəbərçiliklə məşğul olan; çuğul, donosçu; adamsatan. *Xəbərçi yalançı olar, yalançı xəbərçi.* (Ata. sözü). *Onun tərəfindən olun arxayın; Yoxdur kəndimizdə xəbərçi, xayın.* H.K.Sanılı. [Qızıl Arslan Toğrula göndərdiyi məktubda] *Rəiyyətinə o qədər adil və mehriban olmalısan ki, ətrafında casus, xəfiyyə və ya xəbərçilər saxlamağa ehtiyac qalmasın.* M.S.Ordubadi.

**XƏBƏRÇİLİK** *is.* Birindən o birinə xəbər vermə, söz gəzdirmə, çuğulçuluq, şeytançılıq. *Bir tərəfdən də Şahmar xəbərçiliyinin üstündə dişinin dibindən çıxanı* [Şahpərinin] *üzünə çırpmışdı.* B.Bayramov. ☐ **Xəbərçilik eləmək (etmək)** – birinin sözünü başqasına demək, söz gəzdirmək, şeytançılıq eləmək. *Yoldaşından xəbərçilik etmək. Evdən xəbərçilik eləmək.*

**XƏBƏRDAR** *sif.* [*ər.* xəbər və *fars.* ...dar] 1. Bir işdən xəbəri, məlumatı olan, agah olan, məlumatlı. *Ol zalimi-bədxu, şuxisitəmkar; Zakirin halından deyil xəbərdar.* Q.Zakir. *..Oturanların hamısı Məhəmməd Həsən əminin ziyarət qəsdindən xəbərdardılar.* C.Məmmədquluzadə. ☐ **Xəbərdar etmək (eləmək)** – məlumat vermək, əhvalatı bildirmək, çatdırmaq, agah etmək. *Məni işdən xəbərdar et.* – [Rəşid:] *Əzizim, əhvalından məni tez-tez xəbərdar et ki, bəlkə mən də səbr edə biləm.* İ.Musabəyov. *Nurəddin evlərinə qayıtdıqda Bahar onu əhvalatdan xəbərdar etdi.* S.S.Axundov. **Xəbərdar olmaq** – bir şey, hadisə haqqında məlumatı olmaq, agah olmaq, bilmək. *Yoxdur əhvalıma bir kəs ki xəbərdar olsun.* S.Ə.Şirvani. *Bir-birinin əhvalından xəbərdar olandan sonra Bahadır çay tədarükü etdi.* N.Nərimanov. *Şaqqulu işdən xəbərdar olub, həyətə girdi.* Çəmənzəminli.

2. Əmr şəklində: **xəbərdar!** – ehtiyatlı olmağa çağırış.

**XƏBƏRDAREDİCİ** *sif.* Olacaq və ya ola biləcək bir işi birinə başa salmaq, bildirmək, ayıltmaq üçün edilən (işarə və s.). *Nəcəf azca tutqun halda bu tərəfə çevrildi, qızların hər ikisinə xəbərdaredici bir nəzər fırladıb dedi: – Hə, nə təklif var?* M.İbrahimov.

**XƏBƏRDARLIQ** *is.* 1. Xəbərdar etmə, məlumat vermə, qabaqcadan demə, bildir-

mə. *Xəbərdarlıq üçün gələn qadın Tanya idi.* A.Şaiq. *Dəstə hərəkətə gəlməkdə ikən, kiminsə bərkdən bu xəbərdarlığı eşidildi..* Ə.Əbülhəsən. *Zərqələmin bu xəbərdarlıqdan məqsədi vardı.* Ə.Sadıq.

2. Qəbahət edənə bir daha qəbahəti təkrar etməmək üçün verilən göstəriş. □ **Xəbərdarlıq etmək** – qabaqcadan demək, bildirmək, çatdırmaq. *..Güldəstə gərgin halda xəbərdarlıq etdi.* H.Seyidbəyli. *Usta əlindəki taxtanı kəndirlə möhkəm bağladı, xəbərdarlıq edib kəndiri dartdı.* M.Süleymanov. **Xəbərdarlıq vermək** – xəbərdar etmək, qabaqcadan demək, bildirmək. [Toğrul:] *Yoldaş İmamyar doğru deyir,* [Yaşar] *mənə demişdi, ..xəbərdarlıq vermişdi.* C.Cabbarlı.

**XƏBƏR-ƏTƏR** *is.* Xəbər, soraq; iz. *Dörd il idi ki, ondan bir xəbər-ətər yox idi.* S.S.Axundov. [Məsmə:] *..Təzəlikdə heç xəbər-ətər yoxdu. Anası ölmüş düşdü qürbətə, yaman düşdü.* Mir Cəlal. [Sədəf:] *Dörd il Uğurdan heç bir xəbər-ətər olmadı.* İ.Əfəndiyev.

**XƏBƏR-ƏTƏRSİZ** *zərf* Xəbərsiz, izsiz, soraqsız.

**XƏBƏRLƏŞMƏ** "Xəbərləşmək"dən *f.is.*

**XƏBƏRLƏŞMƏK** *f.* Bir-birindən xəbər tutmaq, soraqlaşmaq.

**XƏBƏRSİZ** *zərf* 1. Xəbər vermədən, demədən, soruşmadan, qabaqca bildirmədən; icazəsiz. *Bir gün xanlara tamaşaya gələn qızların içində İskəndərin bacısı Leyla da var idi, qardaşından xəbərsiz qızlara qoşulub gəlmişdi.* E.Sultanov. [Növrəstə:] *Məndən xəbərsiz məni necə ərə verərsən?* Ə.Haqverdiyev.

2. Məlumatsız, biliksiz. *İşlərdən tamamilə xəbərsizdir.*

3. *məc.* Qayğısız, heç bir şeyin fikrini, dərdini çəkməyən. *Səriyyə xala geri döndü və iki körpə qız uşağının hər şeydən xəbərsiz* (z.) *yatdığı tərəfə baxdı..* M.İbrahimov. □ **Xəbərsiz olmaq** – məlumatı, xəbəri olmamaq. ..[Pərşan] *bütün günü evdən çıxmadığını, kino məsələsindən xəbərsiz olduğunu gizlətsə də, hər halda marağını yatıra bilmədi.* M.İbrahimov.

**XƏBƏRSİZ-ƏTƏRSİZ** b a x **xəbər-ətərsiz**. *Xəbərsiz-ətərsiz itmək. Xəbərsiz-ətərsiz yox olmaq.* – [Sərdar:] *Xəbərsiz-ətərsiz gedib, .. bu gün ovçu Ağabala bazarda elə sözlər danışırdı ki...* S.Rəhimov.

**XƏBƏRSİZLİK** *is.* 1. Heç bir xəbər, məlumat olmama.

2. Məlumatsızlıq, biliksizlik, xəbəri olmama.

**XƏBİS** *sif.* [*ər.*] Başqasının pisliyini istəyən, alçaq, əclaf, xain, murdar. *Xəbis adam. Xəbis məqsəd. Xəbis ürək.* – [Bəhram:] [Çiçəklər] *zərifdirlər, xəbis əllərə davam etməyib solarlar.* C.Cabbarlı. [Əsədulla:] *Mən* [Məmmədxanın] *xəbis bir adam olduğunu bilirdim, lakin bu qədər alçaq, pulpərəst olduğunu fikrimə belə gətirməzdim.* P.Makulu. // İs. mənasında. *Müxənnət səgrəqib o xain, xəbis; Nə yaman qandırıb əyyara məndən.* Aşıq Ələsgər. *Prokurorun səsi tutqun çıxdı: – Böhtandır! ..Xəbislər indi də bu taktikaya keçiblər.* M.Hüseyn.

**XƏBİSLİK** *is.* Alçaqlıq, əclaflıq, xainlik, pislik. *Nubar qarının hərəkətləri Qəhrəmanın gözü qabağında öz xəbisliyini göstərirdi.* S.Rəhimov. // Alçaq hərəkət, iyrənc hərəkət, rəzalət. □ **Xəbislik etmək (eləmək)** – alçaqlıq etmək, əclaflıq etmək, alçaq iş görmək.

**XƏBTİ-DİMAĞ** b a x **xəfti-dimağ**. *Səndə vardır nişani-xəbti-dimağ; Səni lazımdır eyləmək bəs dağ.* S.Ə.Şirvani.

**XƏCALƏT** *is.* [*ər.*] 1. Utanılacaq hal, utanmağa səbəb olan şey, utanma. [Gülzar:] *Allah, xəcalətimdən bibimin üzünə baxa bilmirəm.* S.S.Axundov. *İndi qonaqlardan çoxu sanki bir xəcalət hissi duyaraq, başını aşağı dikmişdi.* Ə.Məmmədxanlı. // Xəcalətli. [Sənubər Pərşana:] *Hamıdan çox sənin qarşında xəcalətəm, ana!* B.Bayramov. □ **Xəcalət çəkmək** – çox utanmaq, çox sıxılmaq, həya etmək, ar etmək, utanıb-qızarmaq. *..Yazıq hakimin yanında çox xəcalət çəkdim..* C.Məmmədquluzadə. *Arvadlara gəldikdə, oğlan doğmadıqlarına görə hər ikisi özlərini müqəssir hesab edir və Məşədi Quludan xəcalət çəkirlərdi.* T.Ş.Simurq. *Nərgiz dərhal anasının qucağından sürüşüb yerə düşdü və bir az əvvəlki hərəkəti üçün indi xəcalət çəkdi.* Ə.Məmmədxanlı. **Xəcalət**

**eləmək** – utandırmaq, başıaşağı eləmək, rüsvay eləmək, xəcalət çəkməsinə səbəb olmaq. [Həsən xan:] *Bu ələngələri qonağa göstərib məni xəcalət eləməkdə məqsədin nədir?* "Koroğlu". [Qarı:] *Üzü tökülmüş qız kişini Kəblə Qənbərin yanında xəcalət elədi.* Çəmənzəminli. *Nanəcib insanla olmasın aran; Səni xalq içində xəcalət eylər.* Aşıq Şəmşir. **Xəcalət olmaq** – birinin yanında utanılacaq işi olmaq, xəcalətli olmaq, başıaşağı olmaq. *Namus qədri bilib, nanı gözləyən; İnşaallah, heç yerdə xəcalət olmaz.* Aşıq Ələsgər. *Məzəmmət etməsin səni tay-tuşun; Olma dost yanında xəcalət, oğul!* Aşıq Hüseyn. **Xəcalət vermək** – utandırmaq; utanmasına, sıxılmasına səbəb olmaq, pis vəziyyətdə qoymaq. [Mirzə Səməndər:] *Lap, Hacı Əhməd, xəcalət verirsiniz.* C.Cabbarlı. [Qədir:] *Xəcalət verməyin, a bəy, kasıb evi olanda nə olar? Buyurun yuxarı başa.* Mir Cəlal. **Xəcalətindən çıxmaq** – əvəzini vermək, qarşılıq olaraq bir şey verməklə və ya etməklə əvəzini çıxmaq. [Anası:] *..Vallah, axund, daha bir şey tapa bilmədim. Allah qoysa, yenə xəcalətindən çıxarıq.* B.Talıblı. [Hacı Ağakərim:] *Başın ağrı çəkməsin. Sonra yenə səni görüb xəcalətindən çıxaram.* S.Rəhman.

2. **Xəcalətlə** şəklində – utana-utana, sıxıla-sıxıla. *Haşım çox xəcalətlə şəkərçörəyini çıxarıb arvadına verdi.* B.Talıblı. [Böyük oğlan] *xəcalətlə dedi: – Ata, əlim boşdur, üzüm qara; Su dərdinə yoxdur çara.* M.Dilbazi.

◊ **Xəcalətindən yerə girmək** – bərk utanmaq, adam üzünə baxa bilməmək.

**XƏCALƏTLƏNMƏ** "Xəcalətlənmək"-dən *f.is.*

**XƏCALƏTLƏNMƏK** *f.* Xəcalət çəkmək, utanmaq, sıxılmaq. *Qoşqar xəcalətlənib üzünü yana çevirdi.* İ.Hüseynov.

**XƏCALƏTLİ** *sif.* Birindən gördüyü yaxşılığın əvəzini çıxmadığı və ya verdiyi vədi yerinə yetirmədiyi, ya yerinə yetirə bilmədiyi üçün onun qabağında xəcalət çəkən, utanan, özünü günahkar hiss edən; üzrxah. [Nəbi:] *Mən sənin yanında xəcalətliyəm.* S.Rüstəm. □ **Xəcalətli etmək** – utandırmaq, başıaşağı eləmək, üzüqara eləmək, qızartmaq. [Pərviz xan:] *Ax, nə binamusluq, nə böyük biabırçılıq! .. Sən məni Rəhim xan kimi kişinin yanında xəcalətli elədin!* Ə.Haqverdiyev. **Xəcalətli qalmaq** – birinin yaxşılığının əvəzini çıxa bilmədiyi və ya verdiyi vədi yerinə yetirə bilmədiyi üçün onun qabağında xəcalət çəkmək, sıxılmaq, utanmaq, üzüqara olmaq. [Dostum:] *Ova gəlmişdi. Kişidən xəcalətli qaldıq.* M.Rzaquluzadə.

**XƏCALƏTLİK** b a x **xəcalət**. □ **Xəcalətlik vermək** – xəcalətli etmək, utandırmaq. [Şahsənəm xala:] *Bu nə xəcalətlikdir, ay oğul, mənə verirsən?* E.Sultanov.

**XƏCİL** [*ər.*] *klas.* Xəcalətli, üzüqara. *Hər tənə ki, eyləsən rəvadır; Səndən xəciləm, üzüm qəradır.* Füzuli. *Yüz cəfa gördün, vəli hərgiz şikayət etmədin; Hansı lütfündən xəcilsən nazlı yarın, ey könül!* S.Ə.Şirvani. □ **Xəcil etmək (eyləmək)** – xəcalətli etmək, utandırmaq, qızartmaq, başını aşağı etmək. [Yetər:] *Sizi and verirəm Allahın birliyinə, məni Dilbər xanımın yanında xəcil eləməyin.* N.Vəzirov. [Azər Reyhana:] *And içirəm ki, səni düşmən qabağında xəcil etməyəcəyəm.* Ə.Məmmədxanlı. **Xəcil olmaq** – utanmaq, sıxılmaq, xəcalət çəkmək. *Rənalıq ilə qaməti-şümşadı qılan yad; Olmazmı xəcil sərvi-xuramanını görgəc?* Füzuli. *Oldu sünbüllər xəcil zülfi-pərişanın görüb; Qönçələr qan oldu ta ləli-dürəfşanın görüb.* S.Ə.Şirvani. [Müfti:] *Burda həqiqət sana aydın deyil; Bəlkə qiyamətdə olursan xəcil.* H.Cavid.

**XƏCİLANƏ** *zərf* Xəcalət içində, xəcalət çəkə-çəkə, utana-utana, sıxıla-sıxıla. *Xəcilanə cavab vermək.* – [Məhərrəm] *özlüyündə xəcilanə gülümsədi.* H.Nəzərli.

**XƏDƏMƏ** *is.* [*ər.* "xədim" söz. cəmi] Xidmətçilər, qulluqçular. *Xədəmələr durar sağu solunda; Cavahir bazubənd iki qolunda; Fəvvarələr işlər daim gölündə; Yaşılbaşlı ördək olar, qaz olar.* Ə.Nəbati. *Sol tərəfdə xədəmələr durmuşdular. Bunlar tələbə bileti istədilər. Salman və yoldaşları biletlərini göstərib keçdilər.* Çəmənzəminli.

**XƏDƏNG** *is.* [*fars.*] *klas.* Ox (klassik şeirdə gözəlin kirpiyi oxa oxşadılır). *Cövhəri pak olur təzə cavandan; Hərgiz əl götürməz şövkətü şandan; Müjgan xədənglərin*

*keçirir candan; Peykanının heç poladı əskilməz.* M.P.Vaqif. *Xədəngin cismimi cövşən eyləmiş; Dəlik-dəlik, rövzən-rövzən eyləmiş.* Q.Zakir. *Kirpiyin xədəng oxu; Çatma qaşın yay kimidir.* Aşıq Əsəd.

**XƏDİCƏGÜLÜ, XƏCCƏGÜLÜ** b a x **novruzgülü**. *Nərgizçiçəklilərin .. əksəriyyəti bəzək bitkisidir. Xarakter cinsləri: xədicəgülü, .. aqavadır.* M.Qasımov.

**XƏDİM** *sif.* [*ər.*] 1. Axtalanmış, axta. [Hərəmağası:] *Xədimləri hissdən məhrum zənn edirlər.* Çəmənzəminli. ☐ **Xədim eləmək** – axtalamaq, xacə eləmək.

2. Xidmətçi, qulluqçu. [Ərən:] *Arxa tərəfdən .. kənizlər, nədimlər və xədimlər düzülmüşdülər.* Çəmənzəminli.

**XƏFƏ**[1] *is.* Boğanaq, bürkü, isti hava. [Ruqiyyə:] *..Evdə xəfə var, qaranlıqdır.* A.Divanbəyoğlu. *Əsmə, səmum, bu tərəfə; Ah, yandırır məni xəfə!* M.Dilbazi.

**XƏFƏ**[2] *is.* Heç kəsin görə bilməyəcəyi, gizli, xəlvət yer. *Xəfədə pusmaq. Xəfədə gizlənmək. – Yeri çox xəfə, yolun lap qırağı idi.* Ə.Əbülhəsən.

**XƏFƏ(NƏK)** *is.* Samovarın odunu söndürmək üçün bacasının üstünə qoyulan dəmir qapaq.

**XƏFƏLƏMƏ** "Xəfələmək"dən *f.is.*

**XƏFƏLƏMƏK** *f.* Havanın qabağını tutmaq, boğmaq; sönmək üçün qapamaq. *Samovarı xəfələmək.*

**XƏFƏLƏNMƏ** "Xəfələnmək"dən *f.is.*

**XƏFƏLƏNMƏK** *f.* Xəfə bir yerə çəkilmək, daldalanmaq.

**XƏFƏLİK**[1] *is.* Xəfə, gediş-gəliş olmayan yer, daldalanmağa yarar yer. *Xəfəlikdə gizlənmək.*

**XƏFƏLİK**[2] *is.* Bürkülü, tənəffüsü çətinləşdirən, boğucu ağır hava. *Xəfəlikdən nəfəs almaq olmur. – Otaq yarıqaranlıqdı; Xəfəlikdən boğulsun deyə insan qəlbi; Pəncərəsi qayrılmış insan boyundan qəlbi.* R.Rza.

**XƏFƏNƏG** *is.* 1. At və başqa heyvanlarda ciyər xəstəliyi, təngnəfəslik. *At xəfənəg olub.* // *Sif. mənasında.* Bu xəstəliyə tutulmuş. *Xəfənəg at kimi alırdı nəfəs; Verirdi sinəsi körük kimi səs.* H.K.Sanılı.

2. Təngnəfəslik, sinəgirlik, astma. *Yasavulun bu ürək yarası onu bədən yarasından artıq boğazlayır, ara-ara xəfənək xəstəliyi kimi tutur və buraxmaq istəmirdi.* S.Rəhimov.

**XƏFƏNG** *is.* Pəncərənin və ya qapının üst hissəsi. [Dükanların] *qapıları yan tərəfə deyil, aşağıdan yuxarıya qaldırılmaqla açılardı. Belə qapılara xəfəng deyərdilər.* H.Sarabski.

**XƏFİF** *sif.* [*ər.*] 1. Mülayim, yüngül, yumşaq. *Xəfif yel. – İndi çöldə xəfif meh əsdiyi üçün hava bayaqkı qədər bürkü deyildi.* İ.Əfəndiyev. *Xəfif axşam küləyi əsir, şəhərdə yavaş-yavaş işıqlar alışırdı.* Ə.Məmmədxanlı.

2. Zərif, incə. *Çox çəkmədi ki, qızın yanaqlarında xəfif bir qızartı göründü.* M.Hüseyn. *Zaldakıların üzü xəfif bir gülüşlə işıqlandı.* M.İbrahimov. // Zəif, yüngül. *Xəfif sazaq. – Dünyanın sevinci də, kədəri də ikidir. Biri yüngül, keçəri – xəfif dumana bənzər.* R.Rza. [Xosrov] *..sahildə əyləşib xəfif şırıltıya qulaq asırdı.* B.Bayramov. *Qonaqlara şərbət, çay təqdim edən qulluqçuların ayaqlarının xəfif tappıltısından başqa,* [sarayda] *heç bir başqa səs eşidilmirdi.* P.Makulu. ☐ **Xəfif eləmək (etmək)** – azaltmaq, zəiflətmək. *Basıb pəncərəni, qapını kip-kip; Lampanın odunu eləyib xəfif.* H.K.Sanılı.

**XƏFİFCƏ** *zərf* Azacıq, yüngülcə, zəifcə. [Park] *yalnız yeni çıxmaqda olan ayın ziyası ilə xəfifcə işıqlanmışdı.* S.Hüseyn. *Gənc yenə də xəfifcə gülərək cavab verdi.* M.S.Ordubadi. *Maya qızarıb xəfifcə gülümsədi və Qaraşa baxdı.* M.İbrahimov. // Yavaşca, üsulluca. [Xədicə] *ətəyimdən yapışıb xəfifcə dartaraq deyirdi..* Qantəmir. // Sif. mənasında. *Bir an içində üzündən silinib yox olan təbəssüm izlərinin yerində xəfifcə bir qızartı göründü.* M.Hüseyn.

**XƏFİFCƏSİNƏ** *zərf* Xəfif surətdə, yüngülcə, yavaşca. *Xəfifcəsinə titrəmək. Xəfifcəsinə gülmək.* – [Məsmə:] [Kor seyid] *bərabərimdə dayandı. Sol əlini xəfifcəsinə üzümə götürdü.* S.Hüseyn. [Əhməd:] *Durduğum yerdə ayaqlarımın xəfifcəsinə əsməsi, bütün bədənimə sirayət etmişdi.* T.Ş.Simurq.

**XƏFİYYƏ** *is.* [*ər.*] 1. Xəfiyyə idarəsinin məmuru, gizli agenti. [Əbülhəsən bəy:] *Çar jandarmeriyası mənim dalımca xəfiyyələr*

*təyin etmişdir.* M.S.Ordubadi. *Xəfiyyələr dərnəklərin gizli fəaliyyətindən xəbər tutdular, uşaqların bəzilərini həbs etdilər, qalanlarını isə məktəbdən qovdular.* İ.Şıxlı. ☐ **Xəfiyyə idarəsi** – gizli polis idarəsi. *Aslan .. bildi ki, Hüseynqulu kişi mətbəənin mütamadiyən xəfiyyə nəzarəti altında olduğunu duyub.* M.Hüseyn.

2. Casus. *Xəfiyyə saldılar, pul vəd etdilər; Qoşun topladılar, hara getdilər; Gəlmədi onların heç biri vecə.* H.K.Sanılı.

**XƏFİYYƏÇİ** *is.* Xəfiyyə məmuru, xəfiyyə agenti. *Bu halda xəfiyyəçilərdən biri qapını açdı.* C.Cabbarlı.

**XƏFTİ-DİMAQ** *is.* [*ər.*]: **xəfti-dimaq olmaq** – beyni xarab olmaq, başına hava gəlmək. *Şəhərdə belə danışırdılar ki, Əhməd bəy xəfti-dimaq olub.* Ə.Haqverdiyev.

**XƏKƏ** *is.* [*fars.*] Kömürün ovulub tökülmüş kiçik hissələri; kömür ovuntusu.

**XƏKƏNDAZ** *is.* [*fars.*] Zibil, kül və s. götürmək üçün alət. *Aşpaz Əli aşpazxananın qapısının yanında əlində xəkəndaz samovara kömür salırdı.* C.Məmmədquluzadə. *Qumru dinməz-söyləməz xəkəndazla mollanın yanından elə çırpdı ki, sümükləri şaqqıldadı.* Mir Cəlal. *Kimi özü xəkəndaz götürüb, kimi də dükanların qabağında boynunu büküb dayanan yetim uşaqlara bir-iki qəpik verib səkini suladırdı.* İ.Şıxlı.

**XƏLBİR** *is.* Buğdanın, arpanın və s.-nin zibillərini təmizləmək üçün sağanağa keçirilmiş iri tordan ibarət alət. [Fərraş:] *Ağa, sübhdən mən otağı süpürürdüm, mehtər Kərim əlində xəlbir bura gəldi, məlum olur xəlbiri burda qoyub gedibdir.* M.F.Axundzadə. *Mehtər əlində xəlbir, üzü samanlı, birinin əlində süpürgə, suçiləyən və Gülpəri də gəlirlər.* Ü.Hacıbəyov. ☐ **Xəlbir kimi (tək)** – deşik-deşik. [Mehdi:] *İgidlər, irəli, dalımca gəlin! Xəlbir tək yağının bağrını dəlin!* S.Rüstəm. *Dəlik-deşik elədi düşməni xəlbir kimi.* M.Rahim.

◊ **Xəlbirlə su daşımaq** – vaxtını boş, faydasız işlə keçirmək, hədər yerə sərf etmək.

**XƏLBİRALTI** 1. Bax **xəlbirgözü**.

2. *məc. zar.* Oğul-uşaq, uşaqlar mənasında. [Səlbi ərinə:] *Özün gedirsən, bəs bir çətən xəlbiraltını kim saxlayacaq?* Ə.Vəliyev.

**XƏLBİRGÖZÜ** *is.* Xəlbirlənən buğdadan, arpadan və s.-dən xəlbirin içərisində qalan hissə. *Buğdanın xəlbirgözüsünü təmizləmək.*

**XƏLBİRLƏMƏ** "Xəlbirləmək"dən *f.is.*

**XƏLBİRLƏMƏK** *f.* 1. Xəlbirdən keçirmək. [Mehtər:] *Xəlbir əlimdə idi, atlara arpa xəlbirləyib verəcəkdim, yadımdan çıxıb burda qalıbdır.* M.F.Axundzadə. *Yoldaşlardan biri arpa xəlbirləyir, biri tüfəngini gətirib söykəyir ağaca, biri tüfəngini götürüb aparır.* C.Məmmədquluzadə. *Cəmil arpanı xəlbirləyib atların torbasına tökdü, torbaları atların başına keçirtdi.* Ə.Vəliyev. // *məc.* Saf-çürük eləmək, yaxşılarını yamanlardan ayırmaq. *Xəlbirlənə kaş ömür də; Boş il düşə boş ömürdən...* M.Araz.

**XƏLBİRLƏNMƏ** "Xəlbirlənmək"dən *f.is.*

**XƏLBİRLƏNMƏK** *məch.* Xəlbirdən keçirilmək, xəlbirlə təmizlənmək. *Arpa xəlbirləndi.*

**XƏLBİRLƏTMƏ** "Xəlbirlətmək"dən *f.is.*

**XƏLBİRLƏTMƏK** *icb.* Xəlbirləmə işi gördürmək. *Buğdanı xəlbirlətmək.*

**XƏLBİRVARİ** *sif.* Xəlbirə oxşayan, xəlbirə bənzər.

**XƏLƏF** *is.* [*ər.*] 1. Sonradan gələn, birinin yerinə keçən və ya keçməli olan, onun işini davam etdirən, onu əvəz edən adam. *M.F.Axundzadənin xələfləri. – Ya tələf olmalı, ya xələf.* (Ata. sözü). [Səttarzadə] *təklikdə, ya evdə nə qədər sakit, sönük görünürsə, adam içində, ictimai yerlərdə öz xələflərini görür..* Mir Cəlal.

2. Övlad, varis. *Gör qılsa onu tələf həvadis! Yox bir xələfi ki ola varis.* Füzuli. *Derdim ki, gözəl xələf olarsan; Bir ailəyə şərəf olarsan.* M.Ə.Sabir. *Oğlunun özünə layiq bir xələf olacağından fərəhlənib, xan qocalıq günlərini şad və rahat keçirmək ümidində idi.* M.Rzaquluzadə. // Nəsil, soy. *Öz xələfin gərək gözləyə kişi..* Q.Zakir. *Sən də onun kimi qocalacaqsan, hörmət umacaqsan xələflərindən.* S.Rüstəm.

**XƏLƏL** *is.* [*ər.*] Pozuculuq, əskiklik, zəiflik, nöqsan, ziyan. *Qəflət xələlindən ayrılardın; Əlbəttə kim olduğun bilərdin.* Füzuli. *Vaizi-şəhr öz iqrarına etsəydi əməl; Düşməz idi bu qədər din ilə dünyaya xələl.* S.Ə.Şirvani. ☐ **Xələl dəymək (yetişmək)** –

ziyan dəymək, zərər çəkmək. *Dostluğa xələl dəymək.* – [Əbülhəsənbəy qadına:] *Sizin gözəlliyinizə heç bir xələl yetişməmişdir.* M.S.Ordubadi. **Xələl gəlmək** – ziyanı, zərəri olmaq; pozulmaq; eyibli, nöqsanlı olmaq. *..Eyni musiqi parçasını biz vaxt etibarilə tez və ya yavaş bir sürətlə ifa edə bilərik, halbuki bundan musiqinin ölçüsünə heç bir xələl gəlməz, çaldığımız musiqinin ölçüsü heç də dəyişməz.* Ə.Bədəlbəyli. **Xələl vermək (vurmaq, gətirmək, qatmaq)** – ziyan vurmaq, zərər gətirmək, pozmaq, xarab etmək, eyibli, nöqsanlı etmək. *Gözəlliyinə xələl gətirmək. Sevincinə xələl qatmaq. Oyuna xələl vurmaq.* – *Kitablar Rüstəmin fikir dairəsini genişləndirdi, lakin qəti olaraq onun köhnə əqidəsinə xələl vura bilmədi.* Çəmənzəminli. [Cəmil] *yenə Tahirlə dost olduğunu və aralarındakı incikliyin bu dostluq hissinə heç bir xələl gətirə bilməyəcəyini sübut etmək üçün səsinə mehriban bir ifadə verdi.* M.Hüseyn. *Xanım ..* [uşaqlara] *baxır və onların oyununa xələl qatmaq istəməyərək oğlunun məğlubiyyətinə o qədər də əhəmiyyət vermirdi.* P.Makulu.

**XƏLƏLDAR** *sif.* [*ər.* xələl və *fars.* ...dar] Bir hadisə, iş və s. nəticəsində xələl dəymiş, pozulmuş, dağılmış, korlanmış; nöqsanlı. ◻ **Xələldar etmək (eləmək)** – pozmaq. *..1905-ci il inqilabının dalğaları .. bu küçənin sakitliyini xələldar edib, durğun həyatını çalxalandırmağa başladı.* S.Hüseyn. *Sübhanverdizadə heç bir vaxt yaratmış olduğu bu nüfuzu xələldar etmək və pərdəni yırtmaq istəməzdi.* S.Rəhimov. **Xələldar olmaq** – pozulmaq, dağılmaq. [Əbülhəsənbəy:] *Zənn edirəm ki, Rusiya dövləti sizin mövqeyinizin xələldar olmasına heç vaxt razı olmaz.* M.S.Ordubadi. *Artıq onun yuxusu; Olmayacaq xələldar; Onda fırtına görmüş; Bir dərya sükutu var.* R.Rza.

**XƏLƏT** *is.* [*ər.*] 1. Bəxşiş, hədiyyə. *Hərə bir cür xələt götürüb Eyvazı pişvaz elədilər.* "Koroğlu". [Hacı Mehdi:] *Sənə də bir yaxşı xələt verərəm.* Ə.Haqverdiyev. [Bəşir:] *Sona xala, oğlunu yola gətirmişəm. De görüm, mənə nə xələt verəcəksən?* S.S.Axundov. // Toy, nişan mərasimlərində verilən hədiyyə. *Novruz bayramında qız üçün bayram xələti, novbar meyvə, yemiş alıb göndərərdilər.* H.Sarabski.

2. B a x **xalat** 2-ci mənada. *Sonra üzün dörd nəfər hazırda olan pişxidmətlərə tutub dedi ki: – Xələti-şahanəni gətirin, qibleyi-aləmi geyindirin!* M.F.Axundzadə. *Ağ xələt bürünər, zərnişan geyməz; Heç kəsi dindirib keyfinə dəyməz.* Aşıq Ələsgər. *Bir azdan sonra dəhlizdə böyük lampalar yandı, Əbülfət Mirzə əynində tirmə xələt qapını açdı.* M.S.Ordubadi.

**XƏLƏT-BARAT** *top.* [*ər.*] Bağışlanan şey, pul və s.; bəxşeyiş, hədiyyə. *On səkkiz gün toyda qalandan sonra aşıq xələt-baratını da götürüb, yola düşdü.* Aşıq Ələsgər. [Vaqif Kazıma:] *Nahaq yerə xanın keyfi tutulanda imarətə gəlmirsən. Bilirsən, bol xələt-barat alarsan.* Çəmənzəminli.

**XƏLƏTLİK** 1. B a x **xalatlıq**.

2. *sif.* Hədiyyə, pay olaraq verilmiş, ya ayrılmış. *Xələtlik şeylər.*

**XƏLFƏ** *is.* [*ər.*] 1. Köhnə məişətdə: toy və yas məclislərini idarə edən şəxsə verilən ad. *Son zamanlaradək Kəblə Nəsiri məhəllənin xeyir və şərində "xəlfə" görmək olardı.* S.Hüseyn. *Dərhal xəlfə ağ qalaylanmış mis satıllarda şərbət, əlində gülabzən, camaat ilə bir yerdə küçəyə çıxardı.* H.Sarabski.

2. B a x **xəlifə** 2-ci mənada.

**XƏLFƏLİK** *is.* Xəlfənin işi, vəzifəsi; məclisdə başçılıq.

**XƏLİC** *is.* [*ər.*] *köhn.* 1. Körfəz.

2. Boğaz, kanal.

**XƏLİFƏ** *is.* [*ər.*] 1. *tar.* Bəzi müsəlman ölkələrində Məhəmməd peyğəmbərin vəkili və bütün müsəlmanların başçısı və hamisi sayılan şəxslərə verilən yüksək dini ünvan (xəlifələr Məhəmməddən sonra işğalçı müharibələr nəticəsində yaradılmış ilk dövlətlərdə həm dünyəvi, həm də dini hakimiyyətə malik olmuşlar; vaxtilə Türkiyə sultanları da bu adı daşımışlar). *Padşah həm xəlifə olub, həm də dövlətin yol göstərəni.* N.Nərimanov. *Xətib xəlifə və Ağabəy Məhəmmədə dua etdiyi zamanda da xalqın bu iki ada qarşı bəslədiyi mənfi münasibət bir daha özünü göstərmiş oldu.* M.S.Ordubadi. [Babək:] *Xəlifə və sarayın hədsiz-*

*hesabsız vergiləri hamını cana gətirib.* M.Rzaquluzadə.

2. Keçmişdə molla məktəblərində molla köməkçisi (bu mənada çox vaxt "xəlfə" şəklində işlənir). *Uşaqlardan biri – sonradan bildim ki, bu məktəbdə "xəlifə" imiş – həsrətlə baxdığımı görüb, anamdan mənim də onlarla iştirak etməyimi rica etdi.* T.Ş.Simurq. *Xəlifə ilə mollaya adam getmişdi, hələ gəlib çıxmamışdılar.* Qantəmir. *Molla, həmişə olmadığı zaman öz yerində xəlifə təyin etdiyi oğlana .. dedi: – Bu gedələr yenə gəlməyiblər.* P.Makulu.

◊ **Burda mənəm, Bağdadda kor xəlifə** – çox lovğa, çox təkəbbür, yekəbaş adam haqqında. *Gülöyşə deyir, burda mənəm, Bağdadda kor xəlifə, xəstələri özüm sağaldacağam.* S.Rəhimov.

**XƏLİFƏLİK** *is.* 1. Xəlifənin hakimiyyəti altında olan yerlər, məmləkətlər.

2. Xəlifə ünvanı (titulu).

**XƏLİTƏ** *is.* [*ər.*] 1. B a x **külçə**[1]. *Maqmanı bir xəlitə kimi fərz etmək olar.* M.Qaşqay.

2. Metaləridən sobalarda əridiləcək metalların müəyyən nisbətlərdə qatışığı.

**XƏLQ** *is.* [*ər.*] *klas.* 1. Yaratma, yaradılış. □ **Xəlq etmək (eləmək)** – yaratmaq, vücuda gətirmək. [Abbas:] *Mənim meylim elə sənnən xoş olub; Nə xoş xəlq eyləyib yaradan səni.* "Abbas və Gülgəz". [Arif:] *İnsanları xəlq etmədə var bəlkə də hikmət; İblisə nə hacət?* H.Cavid. **Xəlq olunmaq** – yaradılmaq, vücuda gətirilmək. *Cənab Mövlazadəyə bilmək lazımdır ki, arvad tayfası kişilərin məhz zövqü və ləzzət hissləri üçün xəlq olunmayıbdır.* M.İbrahimov. *O elmin qüvvəsilə xəlq olundu çap maşını; Basar saətdə övraq üstünə min cür əsər, millət!* M.Möcüz.

2. B a x **xalq**. *Ol ki yarın şəbi-hicrinə qiyamət günüdür; Xəlq arasında qiyamət günü olmazmı xəcil?* Füzuli. [Asya və Telli:] *Səy qıl kim, qala səndən; Xəlq içində yaxşı ad.* Ü.Hacıbəyov. *Əvvəlcə sənə söyləmiş idim bu kəlami; Yazma bu qədər jurnalına xəlqi-əvami.* C.Cabbarlı.

**XƏLQİ** *sif.* Xalqa məxsus, xalqa aid, xalqla bağlı; xalq ruhunda olan, xalqın arzu və əməllərini, əhval-ruhiyyəsini ifadə edən.

**XƏLQİLİK** *is.* Xalqla bağlı olma, xalqın arzu və əməllərini, əhval-ruhiyyəsini ifadə etmə. *Azərbaycan dramaturgiyasının xəlqiliyi. Musiqinin xəlqiliyi. – Xəlqilik Cəlil Məmmədquluzadə yaradıcılığının, onun tənqidi realizminin ən güclü cəhətlərindən biridir.* M.İbrahimov.

**XƏLVƏT** [*ər.*] 1. *is.* Tənha yer, gizli yer, heç kəs olmayan yer. *Xəlvətə çəkilmək. Nə xəlvətdə oturmusan? – Verməərəm aləmə xəlvət otaqda; Deyib, gülüb danışmağı səninlə.* Q.Zakir. *Mirzə Səfər eşitmişdi ki, şeir yazmaq üçün iki vasitə lazımdır: xəlvət otaq və bir şüşə şərab.* Ə.Haqverdiyev.

2. *sif.* Adamsız, boş, gediş-gəliş olmayan. *Zora xəlvət küçələrin birində divara vərəqə yapışdırmaq istərkən, almanca danışıq səsləri eşitdi.* S.Vəliyev.

3. *zərf* Xəlvətcə, gizlicə. *Xəlvət pıçıldaşmaq. Xəlvət göz qoymaq.* – [Alı bəy:] *Ay Zeynal, Hacı Qasım azından ildə xəlvət beş dükan tikdirirmi?* Çəmənzəminli. *Sərvətə qul olan bir rüşvətxorun; Xəlvət qazandığı var-dövlət oldu; Aşkar itirdiyi ləyaqət oldu.* B.Vahabzadə. // *sif.* Gizli, xəlvəti, məhrəmanə. *Xəlvəti söhbətimiz var. – Sənin gözəlliyinin mən də çoxdan aşiqiyəm; Nə xəlvəti demək olmur, nə aşikarə sənə.* Ə.Vahid.

**XƏLVƏTCƏ** *zərf* Gizli, gizlicə, heç kəsə hiss etdirmədən, heç kəsə bildirmədən, xəlvət. *Xəlvətcə götürmək. Xəlvətcə yemək. Xəlvətcə çıxıb getmək. – ..Küçənin dönəcəyində yavaşca yapışdım arvadın əlindən və xəlvətcə soxulduq sol tərəfdə bir darvazaya.* C.Məmmədquluzadə. *Orucun atası xəlvətcə Paşa bəyə xəbər verib Xalıqverdini tutdurdu.* Ə.Vəliyev. *Yaşar həmin tüfəngi yada salıb xəlvətcə samanlığa getdi.* M.Rzaquluzadə.

**XƏLVƏTXANA** *is.* [*ər.* xəlvət və *fars.* ...xanə] 1. *köhn.* Xəlvət ev, xəlvət hücrə, yer, xəlvət işlər görülən yer, ev və s. [Bağdadda] *minlərcə xəlvətxanalar, meyxanalar və kef yerləri mövcuddur.* M.S.Ordubadi.

2. *dan.* Xəlvət, tənha, adam olmayan yer. *Həyətləri nanadı; Qulağında tanadı; Əyil, üzündən öpüm; Əcəb xəlvətxanadı!* (Bayatı).

3. Şərq hamamlarında çılpaq yuyunmaq üçün ayrıca yer, otaq.

**XƏLVƏTİ** *sif.* və *zərf* 1. Gizlicə, xəlvətcə. *Xəlvəti danışıq. Xəlvəti iş. Xəlvəti hazırlaşmaq.* – [Əbdül Bəhrama:] *Ağa, izin versəniz, bir kəlmə xəlvəti sizə söz deyim?* C.Cabbarlı. *Mətbəxdəki qadınlar qapının arasından, pəncərənin dalından gələn qonaqları xəlvəti seyr edərdilər.* H.Sarabski. *Özgəyə xəlvəti quyu qazanda; Söylə, öz özündən utanmadınmı?* B.Vahabzadə.

2. B a x **xəlvət** 2-ci mənada. *Kişi Səfərin xatirinə qayıtmaq, sonra xəlvəti yoldan getmək istədi.* Mir Cəlal.

**XƏLVƏTLƏMƏ** "Xəlvətləmək"dən *f.is.*

**XƏLVƏTLƏMƏK** *f.* Gizli, xəlvət iş görmək üçün məqam və ya yer tapmaq, fürsət tapmaq. *Evi xəlvətləmək. Aranı xəlvətləmək.* – *Şimirəli Sonaya tərəf gedir və xəlvətlənib onu çimdikləyir.* C.Məmmədquluzadə.

**XƏLVƏTLİK** *is.* Xəlvət məqam, xəlvət şərait, fürsət. *Ev xəlvətlikdir.* – *Dilən onun boynunu qucaqladı .. xəlvətlik idi.* Mir Cəlal. // Tənhalıq; heç kəs olmadığı vəziyyət, şərait; xəlvət yer. *Zakirlə Mehribanın oturduqları xiyaban xəlvətlik idi.* H.Seyidbəyli.

**XƏMİR** *is.* 1. Unun az su və ya başqa bir maye ilə yoğurulmasından hasil olan suvaşqan kütlə. *Acıtmalı xəmir. Düşbərə xəmiri.* – *Xəmir yeyənin fağırı olmaz.* (Ata. sözü). [Rəşid:] *Xəmir gəldiyinə görə çörəyi yapmaq lazım gəlir.* T.Ş.Simurq. ◻ **Xəmir yoğurmaq (qatmaq, salmaq)** – çörək bişirmək üçün xəmir hazırlamaq. *..İki ildir ki, Sadıq Şamaxıda Rzanın çörəkçi dükanında xəmir salırdı.* "Mol. Nəsr.". *Qız zərif əlləri ilə paltar yudu, xəmir yoğurdu, hətta axır zamanlar çörək yapmaq da ona həvalə olundu.* T.Ş.Simurq. [Göyçək:] *Mən heç bilməmişəm ki, Çiçək xəmir qatacaq.* B.Bayramov. // Yumşaq şey haqqında. *Bu lap xəmirdir ki.*

2. Çiy, yaxşı bişməmiş çörək haqqında. *Bulka lap xəmirdir.*

◊ **Xəmir kimi** – yorğun, əzgin, lırt. [Xalığın] *anası Minnət qarı bir teşt xəmir kimi idi, hara qoysan, orda dururdu.* İ.Məlikzadə. **Xəmiri yumşaq (sıyıq)** – tez yumşalan, iradəsi zəif adam haqqında. *Çox xəmiri sıyıq adamdır.* **Xəmirinə özgə mayası qatmamaq** – öz halal zəhmətilə yaşamaq mənasında. [Səkinə:] *Onu da bilirlər ki, xəmirimə özgə mayası qatmamışam.* M.İbrahimov. **Xəmirləri ayrı cür yoğrulub** – xasiyyətcə bir-birindən çox fərqlənən adamlar haqqında. [Qulu:] *İmi və Ciminin xəmirləri ayrı cür yoğurulub.* İ.Əfəndiyev. **Bu xəmir (hələ) çox su aparacaq (götürəcək)** – çox vaxt, çox səy, sınaq, zəhmət tələb edən, tez başa gəlməyən şey haqqında. [Mürsəl:] *Paşa bəy böyüklərinə bel bağlayır, biz də elə arxalanırıq. Zərər yoxdur, necə deyərlər, bu xəmir çox su götürəcək.* Ə.Vəliyev.

**XƏMİRAĞIZ** *sif.* Ağzıboş, sözü keçməyən, zəif iradəli. *Xəmirağız adam. Xəmirağız* (z.) *olmaq.* – [Şəhrəbanu xanım:] *Hatəmxan ağa, özün bilmirsən ki, bir xəmirağız kişidir. Əvvəldən yaxşı danışdı, sonra birdən boşaldı..* M.F.Axundzadə.

**XƏMİRAĞIZLIQ** *is.* Ağzıboşluq, zabitəsizlik, iradə zəifliyi, qeyri-ciddilik, sözükeçməzlik.

**XƏMİRAŞI** *is.* Əriştə ilə bişirilən, xəmirli duru xörək. *Molla Qasım oğlu Məmmədin qabağına da bir qab xəmiraşı qoyuldu.* M.S.Ordubadi. *Doğranmış duzlu xiyar, iki boşqab xəmiraşı ağ süfrənin üstünü bəzədi.* M.Hüseyn.

**XƏMİRAŞILIQ** *sif.* Xəmiraşı bişirmək üçün hazırlanan, yarar. *Xəmiraşılıq un ayırmaq.*

**XƏMİRÇƏK** b a x **qığırdaq**.

**XƏMİRÇİ** *is.* Xəmiryoğuran, xəmirgir.

**XƏMİRÇİLİK** *is.* Xəmir yoğurma, xəmirhazırlama işi; xəmirgirlik.

**XƏMİRGİR** *is.* [*ər.* xəmir və *fars.* ...gir] Çörəkxanalarda xəmiryoğuran, xəmirtutan işçi. *Məsum kişi xəmirgirin sözündən köyrəldi.* Mir Cəlal.

**XƏMİRGİRLİK** *is.* Xəmirgir işi, xəmiryoğurma peşəsi. *Xəmirgirlik eləmək.*

**XƏMİRXANA** *is.* [*ər.* xəmir və *fars.* ...xanə] Çörəkxanalarda xəmir yoğurulan, xəmir hazırlanan yer. *Məşədi Hüseyn qolu çirməkli, döşü önlüklü xəmirxanadan kürəxanaya keçir, dayanmadan geri qayıdırdı.* Mir Cəlal.

**XƏMİRLƏMƏ** "Xəmirləmək"dən *f.is.*

**XƏMİRLƏMƏK** *f.* 1. Undan xəmir yoğurmaq.

2. Xəmirlə, ya xəmirəoxşar şeylərlə dəlmədeşiyi tutmaq, tıxamaq.

**XƏMİRLƏŞMƏ** "Xəmirləşmək"dən *f.is.*

**XƏMİRLƏŞMƏK** *f.* Xəmirə dönmək, xəmir kimi olmaq; yumşalmaq.

**XƏMİRLİ** *sif.* Xəmirə batmış, xəmirə bulaşmış. *Xəmirli əllər. Xəmirli döşlük. Xəmirli qablar. – Tükəzban xala sevindiyindən özünü itirib əli ilə xəmirli-xəmirli oğlunun boynunu qucaqlamışdı.* İ.Şıxlı.

**XƏMİRYAYAN** *is.* Hazır xəmiri yaymaq üçün xüsusi maşın, alət. // Sif. mənasında. *Xəmiryayan maşın.*

**XƏMİRYOĞURAN** *is.* Xəmir yoğurmağa məxsus xüsusi maşın, alət. // Sif. mənasında. *Xəmiryoğuran maşın.* // b a x **xəmirgir**.

**XƏMRƏ** *is.* Maya, acıtma, balata. *Una xəmrə qatmaq. Xəmrəsi, urvası xəmirsiz qalıb; Dünya düzəlmir ki, düzəlmir, baba!* M.Araz.

**XƏMRƏLİ** *sif.* Xəmrə, maya vurulmuş. *Xəmrəli çörək.*

**XƏMRƏLİK** *is.* Xəmrə üçün ayrılmış xəmir tikəsi, mayalıq xəmir.

**XƏMRƏSİZ** *sif.* Xəmrə qatılmamış. *Xəmrəsiz çörək.*

**XƏMSİ** *is. zool.* Siyənəyəoxşar dəniz balığı.

**XƏMSİN** *is.* [*ər.*] Ərəblərdə: qışın, qırx günündən sonra gələn əlli günlük mövsümünün xalq təqvimində adı, habelə bu dövrdə əsən küləyin yerli adı. *Yer üzündə quru küləklər çox yerdə müşahidə olunur və onların yerli adları vardır: Ərəbistanda səmum, Misirdə xəmsin .. adlanır.* "Ümumi fiziki coğrafiya".

**XƏNCƏR** *is.* [*fars.*] Ucu sivri, iki tərəfi iti soyuq silah. *Otağın baş tərəfindən divardan bir maral başı, bir də tüfəng, onun da altında bir xəncər asılmışdı.* T.Ş.Simurq. [Cahıllar] *çuxanın altından xəncər və dayandoldurum bağlardılar.* H.Sarabski.

◊ **Xəncər-bıçağa çıxmaq** – davaları kəskin şəkil almaq, bir-birini xəncər və ya bıçaqla vurmaq dərəcəsinə gəlmək. **Xəncər-bıçaq olmaq** – qatı düşmən olmaq, ölüb-öldürməyə çıxmaq. [Tapdıq:] *Elə şeyi olmaya-olmaya ağlına gətirəsən, ağa. Molla Sadıqla atan bu saat xəncər-bıçaqdır.* İ.Şıxlı. **Xəncər kimi batmaq (sancılmaq, işləmək), ürəyini xəncər kimi dəlmək** – çox ağır təsir etmək. *Söz də xəncər kimi işləyir cana; Qanı laxtaladır əzab, iztirab.* S.Vurğun. *Hükeymənin inəyi xatırlayıb yavaşcadan ağlaması* [Bəxtiyarın] *ürəyini xəncər kimi dəlir, vicdanını ağrıdırdı.* S.Hüseyn. **Xəncər kimi sağından keçib, solundan çıxmaq** – çox bərk təsir etmək, ürəyinə toxunmaq. *Onun acı sözləri xəncər kimi sağımdan keçib, solumdan çıxdı.* **Xəncərinin qaşı (daşı) düşməz ki... (düşməyəcək ki...)** – bir şeyi özü üçün əskiklik, ar sayma mənasında ifadə. [Gülsənəm:] *Dilman mənimlə gəlsəydi, xəncərinin daşı düşməyəcəkdi ki?* M.Hüseyn. *Səninçün hörmətlə tərpənsə başı; Guya xəncərinin düşəcək qaşı.* S.Rüstəm.

**XƏNCƏRQAYIRAN** b a x **xəncərsaz**.

**XƏNCƏRLƏMƏ** "Xəncərləmək"dən *f.is.*

**XƏNCƏRLƏMƏK** *f.* Xəncərlə vurmaq, yaralamaq; xəncərlə çapmaq.

**XƏNCƏRLƏŞMƏ** "Xəncərləşmək"dən *f.is.*

**XƏNCƏRLƏŞMƏK** *qarş. köhn.* Dalaşaraq bir-birini xəncərlə vurmaq, xəncərləmək.

**XƏNCƏRLİ** *sif.* Xəncər bağlamış, xəncəri olan, yaxud əlində xəncər. *Oturmuşlar məğrur, qollar çirməkli; Xəncərli, qılınclı, patron-tüfəngli.* H.K.Sanılı.

**XƏNCƏRSAZ** *is.* [*fars.*] *köhn.* Keçmişdə xəncər qayıran usta. *Bakıda ümumiyyətlə peşəkarlar: keçəçi, dabbağ, dərzi, xəncərsaz və sairə çox olardı.* H.Sarabski.

**XƏNCƏRVARİ** *sif.* Xəncər kimi, xəncərəoxşar, xəncərşəkilli.

**XƏNCƏRVURAN** *is. köhn.* Keçmişdə məhərrəmlikdə aşura günü xəncərlə öz başını yaran.

**XƏNDAN** *sif.* [*fars.*] *klas.* 1. Gülən, gülər, şən, üzügülər. *Kim görübdür Qövsiyi məhzuni xəndan bir nəfəs?* Qövsi. *Yanaqları güldü, heç olmaz xəndan; Əsildə mələkdi, nəsildə insan.* Aşıq Ələsgər. ☐ **Xəndan etmək** – şənləndirmək, sevindirmək, ürəyini açmaq. *Qönçə tək bağrını əzəldə fələk qan eylər; Sonra könlünü açıb dəhrdə xəndan eylər.* S.Ə.Şirvani. *Qılaram səcdə müdam əcz ilə ol dərgahə; Ki həyatinlə bu*

*gün könlümi xəndan etdin.* A.Səhhət. **Xəndan olmaq** – şadlığından üzü gülmək, fərəhlənmək, sevinmək. *Gözlülər başladılar ağlamağa; Kurlər də ona xəndan oldu.* M.Ə.Sabir. *Sənin xəndan olur gül dodaqların; Onda ki gözümdən yaşlar saçılır..* M.Müşfiq.

2. *məc.* Tamam açılmış (klassik şeirdə gözəlin üzü tam açılmış gülə oxşadılır). *Bədirlənmiş ya bir mahi-tabansan; Ya cənnət bağında güli-xəndansan.* M.P.Vaqif. *Fəxr eyləməsin öz gülünə bülbüli-şeyda; Bir gül hələ də sən kimi xəndan ola bilməz.* Ə.Vahid. ☐ **Xəndan olmaq** *məc.* – tamam açılmaq. *Qızılgül xəndan oldu; Dərmədim dən-dən oldu; Mən səndən ayrılmazdım; Ayrılıq səndən oldu.* (Bayatı). [Qızlar və çocuqlar:] *Açmış bənöfşə, sünbül; Xəndan olur qızılgül; Ötdükcə sanki bülbül; Rəqs etdirir xəyalı.* H.Cavid.

**XƏNDƏ** *is.* [*fars.*] *köhn.* Gülüş.

**XƏNDƏK** *is.* [*ər.*] Torpaqda uzununa qazılmış dərin çuxur. [At] *qabağına çıxan xəndəklərdən məharətlə atılır, balaca qulaqlarını qısaraq çapırdı.* M.Hüseyn. *Bu xəndək bir kilometr uzunluğu, qırx metr eni, otuz metr dərinliyi olan nəhəng bir dərədən ibarətdir.* Ə.Sadıq.

**XƏNDƏKQAZAN** *is.* Xəndək qazımağa məxsus maşın. // Sif. mənasında. *Xəndəkqazan maşın.*

**XƏNDƏKOTU** *is. bot.* İri yarpaqları və boruşəkilli gülləri olan, əsasən xəndək, çay kənarlarında və rütubətli yerlərdə bitən yabanı bitki.

**XƏRABAT** *is.* [*ər.*] *klas.* Meyxana, işrətxana. *Yox, dəxi könlüm mənim meyxanəyə mayil deyil; Kim gəzir ev-ev xərabat içrə hüşyar axtarır.* Qövsi. *Sərməsti-eşq ol, ey gözüm, qəsvət nə lazım; Bir gün gəlir, əldən çıxar zövqi-xərabat.* H.Cavid. ☐ **Xərabat əhli** *klas.* – b a x **xərabati** 1-ci mənada. *Xərabat əhlinin halini bir xümmar olandan sor.* Füzuli. *Biz xərabat əhliyiz, olmaz bizim hüşyarımız.* Qövsi. *İçib mey ta xərabat əhli ondan; Unutsun dərdi, gülsün ömrü bir an.* H.Cavid.

**XƏRABATİ** *sif.* və *is.* 1. Vaxtını meyxanalarda, işrətxanalarda, sərxoşluqda keçirən, əlinə keçən pulu keyfə, içkiyə, eyş-işrətə xərcləyən adam; əyyaş. *Xərabati adam. – Şikəstə Abbasam, xərabatiyəm; Könül, heç görmədim abadan səni.* "Abbas və Gülgəz".

2. *məc.* Pul, şey qədri bilməyən, laübalı adam haqqında. [Kişi:] *Yoxsa onların bir anası var ki, bir xərabatinin biri, ac qurdun biri!* S.Rəhimov.

**XƏRAC** *is.* [*ər.*] *tar.* Vergi, bac. [Koroğlu dedi:] *Verin yeddillik xəracı; Paşalar gətirsin bacı.* "Koroğlu". [Şah Abbas:] *Həmədan vilayətinin üçillik xəracını Mirzə Cəlaləddinə bağışladım.* A.Şaiq.

**XƏRC** *is.* [*ər.*] İşlənən, sərf olunan pul; məsarif, məsrəf, məxaric. [Məşədi İbad:] *A kişi, axı bunun bir anbar da toy xərci var.* Ü.Hacıbəyov. *Buna görə də Hacı Səmsamın gəliri xərcini güclə ödəyirdi.* P.Makulu. // Sərf olunacaq pul. *Demək, Mirzə Qədir Nəsirin evlənmək xərcini verməklə işin içindən çıxa bilməyirdi.* S.Hüseyn. [Bayraməlibəyov] *bütün xərci öz boynuna götürür və yazırdı ki, əgər razı olsalar, indidən bilet satmağa başlayar.* S.Rəhman. ☐ **Xərc aparmaq** – çox pul sərf edilmək, çox xərc tələb etmək, baha başa gəlmək. *Ağarəhim bilmirdi ki, maşın nə qədər xərc aparacaq.* İ.Şıxlı. **Xərc etmək (çəkmək)** – xərcləmək, pul sərf etmək. [Mustafa bəy:] *Mən xərc çəkmişəm, pul tökmüşəm, qabıq qoyub, kəhriz çıxartmışam.* Ə.Haqverdiyev. [Rzaquluxan:] *Qızım, çox şad oluram ki, sənə xərc etdiyim pullar hədər getməyibdir.* M.S.Ordubadi. *Oğlan yengəsi qız evinə güclü xərc çəkib, "yengə xonçası" göndərər.* R.Əfəndiyev. **Xərcə salmaq** – pul xərcləməyə məcbur etmək, çox pul xərcləməsinə səbəb olmaq; pul xərclətmək. [Nazlı Mustafaya:] [Ev sahibləri] *çay təklif eləsələr mən içməyəcəyəm, sən də içmə, kasıb adamdılar, niyə xərcə salaq?* Ə.Məmmədxanlı.

**XƏRC-BORC** *zərf* Borc pul alaraq, borca düşərək, zorla pul taparaq, ondan-bundan borc alaraq. *Xərc-borc etmək.* ☐ **Xərcə-borca düşmək** – borc pul almağa, borca düşməyə məcbur olmaq, borca düşməli olmaq. [Çimnaz] *..ailəni artıq xərcə-borca düşməkdən qorumaq istəmişdi.* Ə.Əbülhəsən.

**XƏRCLƏMƏ** "Xərcləmək"dən *f.is.*

**XƏRCLƏMƏK** *f.* Sərf etmək, işlətmək, məsrəf etmək (pulu). *Şəfiqə xanım yavaş-yavaş var-yoxundan satıb xərcləyirdi.* İ.Musabəyov. *Aslanın indi bir qədər pulu var idi, lakin Fərhad oxuduğu üçün ona xərcləyirdi.* C.Cabbarlı. // *məc. Buna görə nə bir məlhəm, nə bir şəfqət istəyirəm; Can yanğımı xərcləməyə səlahiyyət istəyirəm.* X.Rza.

**XƏRCLƏNMƏ** "Xərclənmək"dən *f.is.*

**XƏRCLƏNMƏK** *məch.* Sərf edilmək, xərc edilmək, işlənmək (pul haqqında). *Pulların hamısı xərclənmişdir. – ..Əsil mayanın bir hissəsi də müntəzəm bir surətdə* [Mahmudun] *gənc və gözəl arvadının naz və qəmzəsinə xərclənirdi.* B.Talıblı. [Adil:] *..Xalam mənim içməyimin fikrini yox, öz pulunun xərclənməsinin dərdini çəkirdi.* B.Bayramov.

**XƏRCLİK** *is.* Adi gündəlik və xırda xərclər üçün verilən, ya ayrılan pul; cib-xərci. [Hacı Mehdi:] *Ala, qabaqcadan da bir az sənə xərclik verim.* Ə.Haqverdiyev. [Məmmədbağır:] *..Əsmərə on manat da xərclik verib getmişdi.* S.Hüseyn. // Xərcləmək üçün pul. [Mina xala:] *Elə bil sümüyün duyubmuş ki, bir gün oğlun məktəbə gedəcək, ona xərclik lazım olacaq.* İ.Şıxlı.

**XƏRÇƏNG**[1] *is. zool.* Buğumayaqlılar tipindən üstü qınla örtülü və baş tərəfdə iri qısqacları olan suda yaşayan onurğasız heyvan. *İri balıqlar başlıca olaraq yanüzən xərçənglər, suda-quruda yaşayan cücülər, habelə molyusklarla qidalanır.* Y.Əbdürəhmanov.

**XƏRÇƏNG**[2] *is.* İnsan və heyvanın həm iç, həm də bayır orqanlarında əmələ gələn xətərli şiş. *Bədbəxtlikdən il yarım bundan qabaq* [Balaşın] *mədəsində xərçəng yarası tapıldı.* M.İbrahimov.

**XƏRÇƏNGKİMİLƏR** *is. zool.* Xərçəngəoxşar onurğasız buğumayaqlılar qrupu. *Xərçəngkimilərlə qidalanan balıqlar.*

**XƏRƏK** *is.* [*fars.*] 1. Daş, qum və s. şeylər daşımaq üçün taxtadan və s.-dən düzəldilmiş alət. *Xərəklə qum daşımaq. – Dəmirov daş daşımaq üçün düzələn xərəyin bir başından, Qocaoğlu isə o biri başından yapışdı.* S.Rəhimov. // Xəstə, yaralı daşımaq üçün iki uzun dəstəyə bənd edilmiş parçadan ibarət alət. *Arazı doktorun müşayiətilə xərək üstündə ikinci palataya gətirib boş bir çarpayı üzərinə uzatdılar.* A.Şaiq. *Beş dəqiqə çəkmədi ki, yaralını xərəyin üstündə gətirdilər.* P.Makulu.

2. Yayla çalınan musiqi alətlərində simlərin altına qoyulan altlıq (taxta və s. parçası).

**XƏRƏNGƏ(LİK)** *is. dan.* Qarmaqarışıqlıq, səs-küy, nizamsızlıq. *Məclisdə bir xərəngəlik vardı. Aralarında qadınlar olmasına baxmayaraq, açıq-saçıq sözlər söyləməkdən çəkinməyirdilər.* S.Hüseyn.

**XƏRƏZİ** b a x **xırdavat**.

**XƏRİF** *sif.* [*ər.*] Qocalıqdan ağlı zəifləmiş, səfehləmiş, sərsəmləmiş.

**XƏRİFLƏMƏ** "Xərifləmək"dən *f.is.*

**XƏRİFLƏMƏK** *f.* Qocalıqdan başı xarab olmaq, beyni kütləşmək, səfehləmək. *Zəki Məmmədbağırın xəriflədiyinə qənaət hasil etdi.* S.Hüseyn. [Arvad:] *Ay kişi, xərifləmisən nədi? Hanı bizim yağımız, düyümüz ki, plov da bişirəm.* "M.N.lətif." // Sarsaqlamaq, sərsəmləmək. *Aşıq Cəlal oyandığını bildirməyəcəkdi, amma düşünəcəkdi ki, ey gidi dünya, nəhayət, mənim ustadım da xəriflədimi?* Ə.Məmmədxanlı.

**XƏRİFLİK** *is.* Ağlı başından çıxmış adamın halı; ağıl seyrəkliyi, sərsəmlik.

**XƏRİTƏ** *is.* [*ər.*] Yer səthinin coğrafi vəziyyətinin kağız və s. üzərində təsviri. *Coğrafiya xəritəsi. Asiyanın xəritəsi. Dünya xəritəsi. Yer üzünün xəritəsindən silinmiş qədim dövlətlər. – Kəndim, balacasan, çox balacasan; Adın yox dünyanın xəritəsində.* M.Araz.

**XƏRİTƏÇƏKƏN** b a x **xəritəçi**.

**XƏRİTƏÇİ** *is.* Coğrafiya xəritələri tərtib edən mütəxəssis; kartoqraf.

**XƏRİTƏÇİLİK** *is.* Coğrafi xəritə çəkmə (tərtib etmə) sənəti; kartoqraflıq.

**XƏSARƏT** *is.* [*ər.*] Ziyan, zərər. [Züleyxa ilə Cəmilin] *yaşadıqları kənd müharibə cəbhəsinə yaxın olduğundan böyük xəsarətlərə düçar olmuşdu.* T.Ş.Simurq. // Xarab olma, korlanma, zədələnmə, sınma. [Zakirov:] *Qəribədir, axşam mən bağı gəzəndə hasarda heç bir xəsarət görmədim.* Ə.Məmmədxanlı. ☐ **Xəsarət vermək** – ziyan vermək, zərər vermək. *Verməmişəm mən ki xəsarət sənə; Sən dəxi vermə əziyyət mənə.* A.Səhhət. **Xəsarət yetirmək (elə-**

**mək)** – ziyan vurmaq, zərər yetirmək, yaxud bir şeylə vurub yaralamaq, zədələmək. [Sultan bəy:] *..Dedim, gedim görüm, bəlkə qız, xudanəkərdə, özünə bir xəsarət yetirdi.* Ü.Hacıbəyov.

**XƏSİL** *is.* Göy taxıl. *Alaq otları torpaqdakı qidalı maddələri almaqla xəsilləri zəifləşdirir. – İl faraş gəlsə, yaylaqda ot, qışlaqda güzdək və xəsil bol olsa, qoyun saxlamaq asandır.* Ə.Vəliyev.

**XƏSİLLƏŞMƏ** "Xəsilləşmək"dən *f.is.*

**XƏSİLLƏŞMƏK** *f.* Göyərmək (taxıl haqqında). *Körpə və tər taxıl xəsilləşirdi.* S.Rəhimov.

**XƏSİLLİK** *is.* Xəsil olan, xəsil əkilən yer. *Xəsillik salmaq.* // Xəsil üçün ayrılan. *Xəsillik arpa.*

**XƏSİS** *sif.* Simic, ifrat dərəcədə qənaətcil, pul xərcləməkdən hər vasitə ilə çəkinən. [Qulu:] *Allah pulu götürüb belə xəsisə verir ki, sandığa qoyub gecə-gündüz keşiyini çəkir.* S.S.Axundov. *Olursunuz, duman olun, sis olmayın; Nədə xəsis olsanız da; Sevgidə xəsis olmayın!* B.Vahabzadə.

**XƏSİSCƏSİNƏ** *zərf* Xəsisə yaraşan bir tərzdə, xəsis kimi. *Əziz Hüsü! ..Sən məktubu xəsiscəsinə yazmağımdan inciyirsən.* Ə.Haqverdiyev.

**XƏSİSLƏŞMƏ** "Xəsisləşmək"dən *f.is.*

**XƏSİSLƏŞMƏK** *f.* Xəsis olmaq, xəsisliyi getdikcə artmaq.

**XƏSİSLİK** *is.* Simiclik, xəsis adamın xasiyyəti. *Hacı Bakıda bir məşhur kişi idi. İstər dövlətdə, istər xəsislikdə.* Ə.Haqverdiyev. ☐ **Xəsislik eləmək, xəsislik göstərmək** – simiclik eləmək, qıymamaq, əsirgəmək. *Əmim xəsislik elədi,* [oğlunu] *oxutmadı.* M.Hüseyn. [Çərkəz:] *..Gətir* [narı] *sıxaq soğanın üstünə. Gətir, xəsislik eləmə. Bir çürük narı Bakıdan gələn qonağa qıymırsan?* İ.Məlikzadə.

**XƏSPUŞ** *is.* [*fars.*] Fırıldaqçı, xırda oğru, cibgir, cibəgirən. *Xəspuşlardan birisi pulları iki əli üzərində Varisə doğru uzadaraq: – Varis bəy, hər kəsdən çox mən qazandım.* A.Şaiq. [Qulamrza Rüstəmbəyə:] *Bu xəspuşların qəribə xasiyyəti var: duz-çörəyə xəyanət etməzlər.* Çəmənzəminli. *Həqiqət bura çox basırıq olur. Həmişə özgə hesabına yaşayan xəspuşlar bunu yaxşı bilir.* Qantəmir.

**XƏSPUŞLUQ** *is.* Fırıdaqçılıq; cibgirlik, xırda oğruluq.

**XƏSTƏ** *sif.* [*fars.*] 1. Səhhəti yerində olmayan, bir xəstəliyi olan; naxoş, azarlı. *Xəstə uşaq. – Xəstə əsgər dərindən nəfəs aldı.* H.Nəzərli. *Xəstə atalarının ürəyini sıxmaq istəməyən oğul və qız güzəranlarından şikayət eləmədilər.* Ə.Abasov. // İs. mənasında. *Xəstənin yanına getmək. Xəstənin halı yaxşılaşdı. – Bənnasız hörgü hörülməz; Təbibsiz xəstə dirilməz.* "Koroğlu". *Əri xəstə üstə getdikdə ya ölü üstə aparıldıqda, o, dükanda oturub alış-veriş edərdi.* S.S.Axundov. *Bunu görən xəstə Aydını heç yaxına belə buraxmamışdı.* H.Seyidbəyli. ☐ **Xəstə düşmək, xəstə yatmaq** – xəstələnmək, azarlamaq, yorğan-döşəyə düşmək. *Xəstə düşdüm, gələn yoxdur üstümə; Qərib öldüm, bikəs öldüm, yad oldum.* M.V.Vidadi. *Həsrətindən xəstə düşdüm; Eylə dərdə çarə, Ceyran!* Aşıq Ələsgər. *Bu hadisədən Molla Qasım sarılıq azarına düşüb xəstə yatdı.* S.S.Axundov. **Xəstə olmaq** – xəstə yatmaq, azarlı olmaq, naxoş olmaq. *Bəstəri-möhnətdə xəstə olduğum; Gözləri şəhlaya dedin, nə dedi?* Q.Zakir. *Mən diqqətlə* [Məmmədə] *baxdım, xəstə olduğuna heç şübhəm yoxdu.* C.Cabbarlı. **Xəstə salmaq** – xəstələndirmək, azarlatmaq, xəstələnməsinə səbəb olmaq. *Yar gəlməsə məndən dirilən olmaz; Məni xəstə salan busə dağıdı.* Q.Zakir.

2. *məc.* Şairanə təşbehlərdə dərdli, qayğılı, mənən üzgün mənasında. *Çox edən bimarə xidmət aqibət bimar olur; Leyk könlüm xəstədir ol nərgisi-bimarsız.* S.Ə.Şirvani.

3. *məc.* Sönük, zəif, cılız, ölgün. *Kiçik bir lampanın ziyası evə xəstə və ölgün bir işıq nəşr edirdi.* S.Hüseyn.

4. *məc.* Bir şeyə həddindən artıq meyil edən, aludə olan; aludə, mübtəla, düşkün. *Kino xəstəsi. Futbol xəstəsi. Bilyard xəstəsi.*

5. *məc. klas.* Yazıq, zavallı, aciz, fağır, bimar. *Füzuli xəstəyə düşmən sözü ilə dust cövr eylər.* Füzuli. *Vidadi xəstəyəm, günlər sanaram; Dərd əhliyəm, qəm hərfini qanaram.* M.V.Vidadi.

◊ **Xəstə baxıcısı** – müalicə müəssisələrində ağır xəstələrə və binanın təmizliyinə baxan kiçik tibb xidmətçisi.

**XƏSTƏHAL** *sif.* [*fars.* xəstə və *ər.* hal] Bir qədər xəstə, kefsiz, halsız, nasaz. *İyirmi beş bahar görmüş bu adam altmış xəzan keçirmiş qoca kimi yorğun, xəstəhal və ölgün görünürdü.* A.Şaiq. // *məc.* Halsız, ölgün, düşkün. *Saqi, tut əlim ki, xəstəhaləm; Qəm rəhgüzərində payimaləm.* Füzuli. *And olsun Kəbəyə, xəstəhalam mən; Can verməyə səri-kuyin istərəm.* Q.Zakir.

**XƏSTƏHALLIQ** *is.* Kefsizlik, halsızlıq, düşkünlük, nasazlıq.

**XƏSTƏXANA** *is.* [*fars.*] Müalicə üçün xəstələrin yatdığı ev, bina, müəssisə. *Xəstəni xəstəxanaya qoymaq. – Yaralı hərbi xəstəxanada .. yatmışdı.* Ə.Məmmədxanlı. *14 oktyabr – qırx doqquz yaşım... Görüşdük onunla xəstəxanada; Əyləşib dərmanım, dərdim yanaşı; Təklikdən qorxanda təklənir adam.* M.Araz.

**XƏSTƏXANALI** *sif.* Xəstəxanası olan. *Xəstəxanalı qəsəbə.*

**XƏSTƏ-XƏSTƏ** *zərf* Xəstə olduğu halda, azarlı-azarlı, naxoş halda. *Xəstə-xəstə qonaqlığa getmək. – Polad Kamilin xəstə-xəstə gördüyü işə məəttəl qaldı.* M.Süleymanov.

**XƏSTƏLƏNDİRMƏ** "Xəstələndirmək"dən *f.is.*

**XƏSTƏLƏNDİRMƏK** *f.* Xəstə etmək, xəstələnməsinə səbəb olmaq, azara salmaq, azarlatmaq, naxoşlatmaq. *Dünənki külək məni xəstələndirdi.*

**XƏSTƏLƏNMƏ** "Xəstələnmək"dən *f.is.*

**XƏSTƏLƏNMƏK** *f.* Azarlamaq, naxoşlamaq, bir xəstəliyə tutulmaq. *Özümü soyuğa verib xəstələndim. – Doğrudan da, keçən il Bakıya, Tahirin yanına gedəndə Gülsənəm arvad xəstələnmişdi.* M.Hüseyn. *Əvəz kişi oğlunun tər köynək dayandığını görüb dedi: – Bala, səhər ertənin soyuğuna özünü vermə, xəstələnərsən.* Ə.Vəliyev.

**XƏSTƏLİK** *is.* Orqanizmin normal həyat fəaliyyətinin pozulması halı; azar, naxoşluq. *Göz xəstəlikləri. Sağalmaz xəstəlik. Yoluxucu xəstəlik. – Aygün xəstəlikdən qalxır ayağa; Qaynayır gözündə yenə də həyat.* S.Vurğun. [Nuriyyə:] *Bilirdim ki, bağırsaq çevrilməsi ağır xəstəlikdir.* İ.Əfəndiyev. □ **Xəstəlik tarixi** – müalicəyə başlanan gündən etibarən müalicə edən həkim tərəfindən yazılan və xəstənin vəziyyətini əks etdirən əsas tibbi sənəd.

**XƏSTƏLİKLİ** b a x **xəstəməzac**.

**XƏSTƏLİKTÖRƏDƏN** *is.* Xəstəlik törəməsinə səbəb olan, azar mənbəyi olan, mikrobları yayan. *Xəstəliktörədən mikroblar.*

**XƏSTƏLİKTÖRƏTMƏ** *is.* Xəstəlik törəməsinə, xəstəlik yayılmasına səbəb olma, xəstəlik mənbəyi olma. *Virusun xəstəliktörətmə qabiliyyəti.*

**XƏSTƏMƏZAC** *sif.* [*ər.*] Xəstəliklərə, tez xəstələnməyə mail olan, tez-tez xəstələnən, üzərindən xəstəlik əskik olmayan.

**XƏSTƏMƏZACLIQ** *is.* Xəstəliyə mail olma; üzərindən xəstəlik əskik olmayan, tez-tez xəstələnən adamın halı.

**XƏŞƏL** b a x **xaral**. *Bir adam ki, .. kömür xəşəllərini dalına şələləyib hıqqana-hıqqana gətirə, ..qalxa-qalxa Müqim bəy Cavanşir kimi bir əsilzadənin mühafizi ola, daha nə üçün vəziyyətindən razı olmazdı.* S.Rəhimov.

**XƏŞƏM** *is. zool.* Şirin sularda yaşayan, yeyilən balıq növü. *İldırım qeyzini sel-sel axıdan; Çapaqdan, xəşəmdən, qızıl balıqdan; Rəng alan, dad alan dəli çaylarım..* X.Rza.

**XƏŞİL** *is.* Suda bişirilib yağ və doşabla yeyilən xəmir xörəyi. *Qarğa özünü quş bilir, xəşil özünü aş.* (Ata. sözü). [Ağa Kərim xan:] *Tez ürəktutan xörəklərdən .. biri xəşildir.* N.Vəzirov. *..Kənd əhli bilirlər ki, doşabsız xəşil olmaz.* Şəhriyar.

◊ **Xəşilə döndərmək** – bir şeyi (maddəni) duru xəmir (horra) halına salmaq, korlamaq. [Süleyman:] [Gübrəni] *aparıb töküblər yağışın altına, döndəriblər xəşilə.* M.İbrahimov. **Xəşilini çalmaq** – öldürmək, işini bitirmək. **Xəşilini çıxarmaq** – əzib-əzişdirmək, sağ yer qoymamaq. *Əsgərin gözünü püfləyənin xəşilini çıxardaram.* M.S.Ordubadi.

**XƏTA** *is.* [*ər.*] Səhv, yanlışlıq, qələt. *Mürəttib xətası. Korrektor xətası.*

**XƏTBAŞI** *is.* Kişilərdə saçın gicgah tərəfdə qulağın qabağında olan hissəsi. [Budaq:] *Yeznəm məni görcək yerindən qalxıb içəridə var-gəl eləməyə, arabir sol əli ilə*

*xətbaşını qaşımağa, gah da bığlarını əlləşdirməyə başladı.* Ə.Vəliyev. [Şərifzadənin] *qısa xətbaşısı əmmaməsinin altından çıxmışdı.* P.Makulu.

**XƏTÇƏKƏN** *is. xüs.* Xətt çəkməyə məxsus alət; cızıqçəkən. *Xətçəkəni lazımi hündürlük ölçüsündə saxlamaq üçün masştabı olan hündürlükölçəndən .. istifadə edilir.* Ə.Əliyev.

**XƏTƏR** *is.* [*ər.*] 1. Təhlükə, qorxu. [Şah öz-özünə:] *İndi bütün ümidim vəzirin fərasətinədir, yəqin keçəni görüb mənim xətərdə olduğumu anlar.* Ü.Hacıbəyov.

2. Ziyan, zərər. [Həcər:] *Ömrün uzun olsun, Qəhrəman qardaş; Xətər görməyəsən heç zaman, qardaş!..* S.Rüstəm. ☐ **Xətər dəymək (gəlmək, toxunmaq)** – 1) ziyan dəymək, zərər dəymək. *Güclü, doludan taxıla xeyli xətər toxundu. – Səlim bildi ki, belə ovçulardan bu quşlara bir xətər gəlməz.* M.Rzaquluzadə. *Nə qarajın qapısından asılan qıfil sındırılıb, nə də maşının açar yerinə bir xətər dəyib.* H.Seyidbəyli; 2) fəlakət, bədbəxtlik üz vermək; fəlakətə, faciəyə uğramaq, ziyan dəymək. *Mən misal üçün deyirəm ki, iki-üç günlüyə göz-qulaq olaq ki, uşaqlara bir xətər toxunmasın.* S.Rəhimov. [Şeyx Amiri qullara:] *Dərhal oğlumun izinə düşüb səhraya gedin! Dalınca gəzin, keşiyin çəkin, ona bir xətər dəyməsin.* Ə.Məmmədxanlı. **Xətər vurmaq** – qəsd etmək, ziyan vurmaq; öldürmək. [Qarı Nurəli xana:] *İndi sənə bir yağı göz dikibdir, .. xətər vurmaq istəyir.* Çəmənzəminli. **Xətər yetirən** – toxunan, təhqir edən. *Qayınata isə arvadı ilə namusa xətər yetirən sözlər icad edib, gəlinə min böhtanlar isnad verirdilər.* Çəmənzəminli. **Xətər yetirmək** – zərər yetirmək, fəlakətə uğratmaq, canına qəsd etmək; vurmaq, yaralamaq. [Eyvaz dəlilərə:] *Biz əgər belə şəhərə girsək, Koroğluya xətər yetirərlər.* "Koroğlu".

**XƏTƏRLƏNMƏ** "Xətərlənmək"dən *f.is.*

**XƏTƏRLƏNMƏK** *f.* Xətər dəymək, zərər, ziyan görmək. // Korlanmaq, xarab olmaq, zədələnmək. *Blindajın divarları və tavanı adda-budda xətərlənmişdi.* Çəmənzəminli.

**XƏTƏRLİ** *sif.* Çox qorxulu, çox təhlükəli, təhlükə ilə dolu, xətər gətirə bilən, xatalı. *Xətərli səfər. Xətərli yol. Xətərli iş.* – [Gülbahar:] *Bəlkə xətərli yaradır .. qolunu belə, başına dönüm, çıxart, Əhməd!* N.Vəzirov. [Birinci qul Məcnuna:] [Vətənə getmək] *hələ mümkün deyil, mərhəmətli ağa, hələ yollar xətərlidir.* Ə.Məmmədxanlı. // Zərərli, ziyanlı.

**XƏTƏRLİLİK** *is.* Qorxulu, təhlükəli olma, xətər gətirmə; təhlükəlilik.

**XƏTƏRNAK** *sif.* [*ər.* xətər və *fars.* nak] *klas.* bax **xətərli**. *Sərsəri basma qədəm eşq təriqinə, Füzuli; Ehtimal eylə ki, qayətdə xətərnak səfərdir.* Füzuli. [Mirzə Rza:] *Gəzinmə İran adında xətərnak səhralarda, qayıt Firəngistana, Fərhad!* C.Cabbarlı.

**XƏTƏRSİZ** *sif.* Qorxusuz, təhlükəsiz, xatasız. *Xətərsiz iş. Xətərsiz səfər.* – [Ataş:] *Xalıqverdi əmi deyirdi ki, Turaclı yolu xətərsizdir.* Ə.Vəliyev. [İsmayıl kişi Namaza:] *Sən bir qədər adam götür, arvad-uşağı xətərsiz yerə apar və özün də orada qal!* P.Makulu. // Ziyansız, zərərsiz.

**XƏTƏRSİZLƏŞDİRMƏ** "Xətərsizləşdirmək"dən *f.is.*

**XƏTƏRSİZLƏŞDİRMƏK** *f.* Xətərsiz etmək, qorxusuz, təhlükəsiz hala gətirmək. [Veysəl] *Kəngərlini qorxudub buradan uzaqlaşdırmaq, Ataşın yolunu xətərsizləşdirmək istəyirdi.* Ə.Vəliyev.

**XƏTƏRSİZLƏŞMƏ** "Xətərsizləşmək"dən *f.is.*

**XƏTƏRSİZLƏŞMƏK** *f.* Qorxusuz, təhlükəsiz olmaq, əminlik olmaq. *Yollar xətərsizləşib.*

**XƏTƏRSİZLİK** *is.* Xətərsiz, qorxusuz olma; təhlükəsizlik, əmin-amanlıq.

**XƏTİB** *is.* [*ər.*] Məsciddə xütbə oxuyan din xadimi. *Xətib minbərdən yerə düşməmiş, əhali hakimi və xətibi gözləməyərək məsciddən çıxdı.* M.S.Ordubadi. // *köhn.* Gözəl natiq.

**XƏTİBLİK** *is.* Xətib vəzifəsi, xətibin işi.

**XƏTİR** *is.* [*ər.*] Hörmət, ehtiram, sayğı; şan-şərəf. *Xətrini əziz tutmaq. Xətrini istəmək. – Xətir üçün xəstə yatmazlar.* (Ata. sözü).

◊ **Xətir qoymaq (saxlamaq)** – hörmət eləmək, hörmətini saxlamaq; güzəşt eləmək. **Xətri qalmaq** – incimək, narazı qalmaq, könlü qırılmaq. **Xətri xoş olmaq** – ürəyi açılmaq.

**Xətri(n) istədiyi qədər** – b a x **ürəyi(n) istədiyi qədər** ("**ürək**"də). **Xətrindən keçməmək** – b a x **üzündən keçə bilməmək** ("**üz**"də). [Xəlfə:] [Dursun] *daha Aslan bəyin xətrindən keçmərəm.* C.Cabbarlı. **Xətrinə dəymək (qıymaq, toxunmaq)** – könlünü qırmaq, ürəyinə (qəlbinə) dəymək, toxunmaq. *Nə dedim xətrinə dəydi; Üzün məndən niyə döndü?* Aşıq Ələsgər. *Nə bir nəfər ona "yox" dedi; Nə bir nəfər xətrinə qıydı.* R.Rza. **Xətrini istəmək** – yanında hörməti olmaq, çox saymaq, hörmət etmək, sevmək. *İkram əmisi Ağayarın xətrini çox istəyirdi.* Ə.Əbülhəsən. **Xətrini qırmaq (sındırmaq)** – b a x **xətrinə dəymək**.

**XƏTİR-HÖRMƏT** b a x **xətir**. *Xətir-hörmət saxlamaq. Xətir-hörmət gözləmək. Xətir-hörmət bilmək.* – [Sərvinaz qarı:] *Bala, Həsrət, belə şeylərə qol qoyma, yoxsa aralıqda olan bütün xətir-hörmət tökülər.* B.Bayramov.

**XƏTİRLİ** *sif.* Xətri əziz, hörmətli, hörmət edilən, sayılan, ehtirama layiq, nüfuzlu. *Xətirli adam.*

**XƏTKEŞ** [*ər.* xətt və *fars.* ...keş] b a x **xətçəkən**. *Xətkeşlə cızıq çəkmək.* – [Gəldiyevin] *düz on yeddi gün qələm, xətkeş, pərgar, rezin əlindən düşmədi.* Mir Cəlal.

**XƏTM** *is.* [*ər.*] 1. Bitirmə, qurtarma, sona çatdırma. ◻ **Xətm etmək (eləmək)** – 1) bitirmək, tamamlamaq, sona çatdırmaq. *Billah ki, nə xoş demiş Nizami; Bu babdə xətm edib kəlami.* Füzuli*;* 2) *din.* oxuyub tamamlamaq, bitirmək (Quranı). *Şaşırmış qardaşımı dövrələmiş məktəb uşaqları anama* [dedilər:] – *Muştuluğumu verin, Abdulla .. Quranı xətm elədi.* T.Ş.Simurq. *Axşam Quran çıxmış uşaq atasına deyərdi ki, mən sabah Quranı xətm edəcəyəm.* H.Sarabski.

2. *hüq.* İşi bağlama, qurtarma. ◻ **Xətm etmək** *hüq.* – bağlamaq, qurtarmaq. *Sübut olmadığından məhkəmə işi xətm etdi.*

**XƏTMİ** b a x **gülxətmi**. [Çöllərdə] *nərgiz, nanə, xətmi, nilufər, nə desən taparsan.* Mir Cəlal.

**XƏTT**[1] *is.* 1. Yazarkən hərfləri təsvir etmə tərzi, yazı yazma xüsusiyyəti; yazı. *Gözəl xətt. Uşaq xətti. Tanış xətt.* – [Yaqut:] *Məktubu açmışdım və uşaq xəttinə oxşar o tanış xətti görərkən yenə əllərim titrəmişdi.* Ə.Məmmədxanlı. *Reyhanın çox səliqəli; Gözəl, təmiz bir xətti var.* M.Dilbazi.

2. Nazik saqqal. *Yumşaq barmaqlar Xəlilin xətt yerindən çənəsinə qədər titrəyə-titrəyə gəzdi. Üzünə isti nəfəs dəydi.* İ.Məlikzadə.

**XƏTT**[2] *is.* [*ər.*] 1. Cızıq. *Kağızda dikinə çəkilən xətlərin sayı indi beş idi.* Ə.Əbülhəsən.

2. İki məntəqəni birləşdirən yol. *Moskva – Bakı dəmiryol xətti. Moskva – Kiyev hava xətti. Trolleybus xətti.* // Teleqraf, telefon rabitəsi qurğuları (məftillər, kabellər və s.); su, kanalizasiya sistemi. *Teleqraf xətti. Telefon xətti xarab olmuşdur. Xəlil içəri girib isti su xəttinin üstündəki manometrə nəzər saldı.* İ.Məlikzadə. // Elektrik enerjisini nəql etmək üçün qurğular (məftillər, kabellər və s.) sistemi. *İki saatdan çox idi ki, kəşfiyyat buruğunda elektrik xətti korlanmışdı.* M.Hüseyn. *..Xətdə cərəyan var, işə başlamaq olar.* M.Süleymanov. // Yan-yana durmuş şeylərin uzun sırası, bir şeyin arasıkəsilməz sırası. *İstehkam xətti. Müdafiə xətti.* – *Bəhram şah Bərdəsirin mühasirə xəttini yarmağa və Atabəy Məhəmmədə qalib gəlməyə müvəffəq olmayacaqdır..* M.S.Ordubadi.

3. Bir dövlətin hüdudu, sərhədi və bu sərhəd boyunca olan istehkamlar sırası. *Vaqifin yazdığı məktub Qafqaz xəttindəki baş komandan .. vasitəsilə Yekaterinaya göndərildi.* Çəmənzəminli. // Vuruşan iki tərəf arasında uzanan yer, döyüş gedən yer. *Vuruşmanın qızğın vaxtında rota komandiri Zəhranı çağırdı və tapşırıq verib qabaq xəttə göndərdi.* Ə.Vəliyev. *Orda mən bilirdim ki, cəbhə xəttinin o tərəfində düşmən durur.* H.Seyidbəyli.

4. Cizgi. *Kim olduğunu daha bilmədiyim bu qadını yalnız üzünün xətləri, hal və tövrilə öyrənmək istəyirdim.* S.Hüseyn. *Baxıram heykələ... mən heyrətdəyəm... Necə yerindədir hər xətt, hər qırış!* B.Vahabzadə.

5. *məc.* İstiqamət, hərəkət, görüş tərzi. *Düzgün xətt. Yanlış xətt. Orta xətt götürmək.*

6. Qan qohumluğu əsasında birləşmiş adamların ardıcıl sırası, əcdadlar, nəsillər sırası. *Ata xətti ilə qohumluq.*

**XƏTTAT** *is.* [*ər.*] Gözəl xətti olan adam, gözəl yazı yazan adam. [Vaqif] *..bir şeir Tiflisin və valinin mədhinə, bir ayrısını da vəliəhdə ithaf olaraq yazdı, üzü göçürülmək üçün özü ilə gətirdiyi xəttata verdi.* Çəmənzəminli.

**XƏTTATLIQ** *is.* Gözəl xətlə yazma sənəti.

**XƏTTİ-HƏRƏKƏT** *is.* [*ər.*] 1. *köhn.* Döyüşü hazırlama və aparma sənəti, döyüş üsulları; taktika. *Düşmənin xətti-hərəkəti.* – [Nizami:] *Biz, Fəxrəddinin göstərdiyi xətti-hərəkətlə irəli getsək, fars və ərəb cahangirlərinin keçmişdə və bundan sonra aparacaqları xətti-hərəkətə kömək vermiş olacağıq.* M.S.Ordubadi.

2. *məc.* İctimai və siyasi mübarizə üsul və vasitələrinin məcmusu. // Hər hansı məqsədə çatmaq üçün tətbiq edilən üsul və vasitələr, tədbirlər. *Salman,* "*siyasi məsələlər həll olunmasa, maarif məsələsi həll oluna bilməz*"*, – deyə qəti bir xətti-hərəkət yürüdürdü.* Çəmənzəminli. *Darülfünun eşiyində və içərisində daima tələbələr dəstə-dəstə toplaşıb, vermiş olduqları tələbləri, maarif nəzarətinin və darülfünunun müdiriyyətinin xətti-hərəkəti ətrafında müzakirə edirlərdi.* T.Ş.Simurq.

**XƏTTÜ XAL** *is.* [*ər.* xətt və *fars.* xal] *klas.* Gözəlin sifəti mənasında. *Qoymazsan baxmağa xəttü xalına; Tamaşayi-camalını kəsibsən!* M.P.Vaqif. *Xəttü xalə verib xeyli nəzakət; Siyah zülfü hamısından baş çəkib.* Q.Zakir.

**XƏTVARİ** *sif.* Xətt kimi, xəttəoxşar, xətt şəklində. *Xətvari yarpaq.*

**XƏYAL** *is.* [*ər.*] 1. Bir şəxsin və ya şeyin insan fikrində, təsəvvüründə təcəssüm edən surəti; təxəyyül. *Onun xəyalı heç vaxt gözümün qabağından getmir.* // Xəyala, fikrə gələn şeylər; xəyalat. *Pəncərənin önündə o, dayanır lal kimi; Gördükləri görünür gözünə xəyal kimi.* B.Vahabzadə. *Yenə uzaq yollar keçir gözümdən; Yenə min xəyalda, min soraqdayam.* N.Xəzri.

2. Fikir, düşüncə. *Xəyalım hürr, can sərbəst, fikrim laübalıdır; Məni azad edən sultani-əqli-nöktədanımdır.* M.Hadi. ☐ **Xəyal eləmək (etmək)** – təsəvvürünə gətirmək, ağlına gətirmək, xəyalına gətirmək, düşünmək, fikir eləmək. *Nə xəyal eləyirsən? – Könül titrər, gözüm görməz, əlim tutmaz, ayaq getməz; Görər heyranlığım canan, xəyal eylər ki, təmkindir.* Qövsi. *Hər axşam Şəban evə gələndə xəyal edirdi ki, Gülsüm həmişəki tək onun qabağına çıxıb əlinə su tökəcək, öz əli ilə qəbrə qoyduğu Gülsümün öldüyünə inanmırdı.* Ə.Haqverdiyev. *Məşədi Əsgər öz-özünə xəyal etdi ki, həqiqətdə həmin qərib müsafirin çamadanını əlindən qapıb qaçmaq çox asanca işdir.* S.M.Qənizadə. **Xəyala dalmaq (qapılmaq, getmək)** – fikrə getmək, dərin düşüncəyə dalmaq. *İndi* [Şiraslan] *yeni bir xəyala qapılır, sanki kainatla qovuşur...* S.Rəhimov. *Dərin xəyala dalsan; Mən sükutun olaram.* N.Xəzri. *Mən .. bəzən də qoca bir kötüyün üstündə oturub xəyala gedirəm.* Z.Xəlil. **Xəyala gəlmək** – 1) yada düşmək, anılmaq, xatırlanmaq, təsəvvürə, fikrə gəlmək, xəyalında canlanmaq. *Ol afitabrüxlə keçən günlərim mənim; İndi gəlir xəyalıma hicrində xabtək.* S.Ə.Şirvani; 2) ağlına gəlmək, düşünmək. *..Xəyalıma gəldi ki, nökərimiz evi süpürəndə süpürgənin tikanı düşüb fərşin üstünə və batıb qonağın yumşaq yerinə.* C.Məmmədquluzadə. **Xəyalına gətirmək** – xəyalında, təsəvvüründə canlandırmaq, yadına salmaq, xatirə gətirmək, düşünmək, fikrinə, təsəvvürünə gətirmək. *Bəndalı xəyalına gətirə bilməzdi ki, adam adama əvəzsiz, pulsuz bir xeyir iş görə.* Mir Cəlal. *Qarı oturduğu yerdə gözlərini yumub, dumana bürünmüş uzaq günlərini xəyalına gətirdi..* Ə.Məmmədxanlı. **Xəyalına girmək** – ağlına gəlmək, fikrinə gəlmək, düşündürmək. [Taybuynuz öküz] *işə bir az ağır gedəndə yaman sözlərdən, töhmətdən və döyülməkdən başqa bir şey görüb eşitmir, onun ac və susuz qalmağı da bir kəsin xəyalına girmir...* F.Köçərli. **Xəyalında canlanmaq** – təsəvvüründə, hafizəsində canlanmaq, gözünün qabağına gəlmək, təsəvvürünə gəlmək, yadına düşmək. *Gələcək Bakı – əməkçi Bakısı xəyalında canlanır.* M.S.Ordubadi. *Hər gecə əxilər süfrəsi başında gördüyü o müxtəlif qəriblər və kimsəsizlər içərisində yavaş-yavaş bu qocanın da siması* [yolçunun] *xəyalında canlanırdı..* Ə.Məmmədxanlı.

3. *məc.* Arzu edilən, həsrəti çəkilən şey mənasında. *Ləbin xəyalı ilə dildə şur olur peyda; Bəli, nəməklə olur, rəsmdir, kəbab ləziz.* S.Ə.Şirvani. [Mayanın] *ata minmək, atın üstündə yol getmək isə şirin xəyalı idi.* M.İbrahimov. □ **Xəyalından keçmək** – fikrindən keçmək, arzusunda olmaq, ürəyindən keçmək. [Hacı Kamyab:] [Fərmanın] *xəyalından mənim qızımı almaq keçir. Qoy xəyalplovdan nə qədər yeyəcək, yesin.* Ə.Haqverdiyev. // Başa gəlməz, boş xəyaldan ibarət olan şey; xülya. *Sevda nədir? Hicran nədir? Bir xəyal!* M.Müşfiq. □ **Xəyal kimi** – kölgə kimi, kabus kimi. *Doğrusu ... hər zaman gözlərimdə siz; Gəlib durursunuz bir sual kimi; Gah şirin, gah acı bir xəyal kimi.* S.Vurğun. *Otağı göyümtül papiros tüstüsü bürüdüyündən, adamların siması xəyal kimi dumanlı görünürdü.* M.Hüseyn. *Dağlarımın başından qalxıb bir qartal kimi; Gəzdim ana yurdumu canlı bir xəyal kimi.* R.Rza.

**XƏYALAT** *is.* [*ər.* "xəyalət" söz. cəmi] 1. Əsli olmadığı halda gözə görünən mövhum surət; həqiqətdə deyil, yalnız xəyalda, fikirdə, təsəvvürdə olan şeylər; xülya, kabus. [Cəlil Məmmədquluzadə] *xəyalata uyan idealların gözəlliyi ilə yaşayıb, varlığa tül pərdələr dalından baxan yazıçılardan deyildi.* M.İbrahimov.

2. Fikir, düşüncə; fikirdə, xəyalda olan, arzu edilən şeylər. *Yüz sənə bundan əqdəm ata və babalarımızın .. arzu və təmənnalarını, fikir və xəyalatını* [Vaqif] *yazıb..* F.Köçərli. *Əhməd xəyalata o qədər inanmışdı ki, qazanacağı 500 manatın cınqıltısını cibində eşidir və xəyalatı canlandırırdı.* B.Talıblı. □ **Xəyalat eləmək** – çox fikir eləmək, çox düşünmək, fikirləşmək, fikrində götür-qoy eləmək. [Xırda xanım:] *..Bol xəyalat eyləmişəm. Bir neçə vaxt işi düzəldib toy fikrinə düşmüşəm..* N.Vəzirov. **Xəyalat götürmək** – dərin düşüncələrə qərq olmaq, fikir-xəyal götürmək. *İnsanı xəyalat götürəndə hər cür nataraş fikirlər adamdan əl götürmür.* C.Məmmədquluzadə. *Bir neçə vaxt gözümə yuxu getmədi, xəyalat məni götürdü.* Ə.Haqverdiyev. *Həmzəbəyi xəyalat götürdü.* Çəmənzəminli.

**XƏYALÇI** b a x **xəyalpərəst**.

**XƏYALÇILIQ** b a x **xəyalpərəstlik**.

**XƏYALƏN** *zərf* Xəyalında, fikrində, təsəvvüründə, zehnində; fikrən, zehnən. *Xəyalən sənin yanındayam. Xəyalən onun surəti gözümün qabağında canlandı. – Eyvaz dəfələrlə xəyalən Gülşənin qüvvətli əllərini əlinə alıb demişdi..* Ə.Vəliyev. *Sənə vətənimdən salam gətirdim; Xəyalən üstünə qanad da gərdim.* N.Xəzri. [Ümid] *bir an içərisində xəyalən iş sahəsinə getdi.* B.Bayramov.

**XƏYALƏT** [*ər.*] b a x **xəyal** 1-ci mənada.

**XƏYALİ** *sif.* 1. Əslində olmayıb, göz qabağına gətirilən, təsəvvür edilən, xəyalda canlanan; qeyri-həqiqi, qeyri-real. *Xanım görmədiyi ölkənin xəyali gözəlliyinə məftun bir halda sözünə davam edirdi.* Çəmənzəminli. *Bir zaman, doğrudan da, xəyali bir məhəbbətlə sevdiyi qızın iztirab və göz yaşlarına qarşı Səlim biganə və laqeyd baxa bilmədi.* M.İbrahimov.

2. *riyaz.* Təsəvvür edilən, xəyala gətirilən, uydurulan. *..Xəyali ədədlər müasir riyaziyyatda geniş surətdə tətbiq olunur.* Z.Xəlilov.

**XƏYALLANMA** "Xəyallanmaq"dan *f.is.*

**XƏYALLANMAQ** *f.* Dərin fikrə, xəyala dalmaq, keçmişləri göz qabağında canlandırmaq; fikirləşmək. *Şərifzadə öz-özünə xəyallanır, gözünün altından qarovulçuya baxır, onun mürgüləməsini gözləyirdi.* M.Hüseyn.

**XƏYALPƏRƏST** *sif.* və *is.* [*ər.* xəyal və *fars.* ...pərəst] Xəyala, düşüncələrə qapılmağı sevən, ona mail olan; xülyaçı. *Xəyalpərəst uşaq gecələr yatağına girdiyi zaman bədbəxt anasını gözləri önünə gətirir.* A.Şaiq. // Dalğın. [Firidun] *sakit və xəyalpərəst baxışlarla Südabəni, anasını süzür..* M.İbrahimov. *Vəli əvvəllər xəyalpərəst və laübalı bir gənc idi.* M.Hüseyn.

**XƏYALPƏRƏSTLİK** *is.* Xəyala, düşüncələrə qapılma; xəyalpərvərlik, real həyatdan uzaqlaşıb fantastika aləminə getmə; xülyaçılıq. *Bugünkü vəziyyətin şəklini dəyişmədən xoşbəxtlik məsələsini meydana atmaq xəyalpərəstlikdir, hissiyyatpərvərlikdir, bunların heç birisindən xoşbəxtlik ummaq olmaz.* M.S.Ordubadi.

**XƏYALPƏRVƏR** *sif.* [*ər.* xəyal və *fars.* ...pərvər] b a x **xəyalpərəst**. [Xasayoğlu Adiləyə:] *Hələ ilk gəncliyində* [İlyas] *xəyalpərvər idi. Bəzən həddindən artıq öz qüvvəsinə inanardı. Bəzən məyus olub özü öz gözündə məhv olardı.* Ə.Məmmədxanlı. *Teymur müəllim şirinsöhbət və xəyalpərvər bir gənc idi.* Ə.Sadıq.

**XƏYALPƏRVƏRLİK** b a x **xəyalpərəstlik**.

**XƏYALPLOV** *is.* Həqiqətdə mümkün olmayıb ancaq xəyalda ola bilən şey; xülya. [Hacı Kamyab:] [Fərman] *qoy xəyalplovdan nə qədər yeyəcək, yesin.* Ə.Haqverdiyev. *Xəyalplov Ələmdarın uzun ayaqlarını yerdən üzdü.* S.Rəhimov.

**XƏYANƏT** *is.* [*ər.*] 1. Özünə olan etimaddan sui-istifadə edərək dönüklük etmə; xainlik, xaincəsinə hərəkət, etibarsızlıq. [Sərdar Rəşid] *bu xəyanətini həyata keçirmək üçün fürsət tapmayacaqdır.* M.S.Ordubadi. *Aradan üç ay keçmişdi. Bu üç ay içərisində Şükür kənddə bir çox cinayətlər və xəyanətlər şahidi olmuşdu.* S.Hüseyn. [Qartal:] *Xəyanət ən böyük bir ordunu belə yıxa bilər.* M.Hüseyn. // Düşmən tərəfə keçmə, düşmənə satılma; satqınlıq. *Neçə kərə; Tarix endi zirvələrdən dərələrə; Bu hiyləgər xəyanətlər; Tariximin neçə-neçə varağını; ləkələdi, qaraladı.* B.Vahabzadə. □ **Xəyanət etmək (eləmək)** – xain çıxmaq, satqınlıq eləmək, satılmaq, etibarsız çıxmaq. *Dostuna xəyanət etmək.* – [Yusif:] *Bu gün bazarda Murad rast gəlib deyir ki, çörək verib bəslədiyin şəxs sənə xəyanət edir.* N.Nərimanov.

2. Namərdlik, vəfasızlıq, etibarsızlıq, dönüklük, əhdi pozma. *Sevgilisinə xəyanət etmək.*

**XƏYANƏTÇİ** *sif.* və *is.* Xəyanət edən; xəyanətkar, xain. *Çünki xəyanətçisiz cümlə müsəlmanlara; Mənzilinizdir səqər, oxutmuram, əl çəkin!* M.Ə.Sabir.

**XƏYANƏTÇİLİK** *is.* Xəyanət etmə, xain olma; xəyanətkarlıq.

**XƏYANƏTKAR** *sif.* [*ər.* xəyanət və *fars.* ...kar] Xəyanət edən, xəyanətçi; xain, satqın, etibarsız. [Hüsnübəyim:] *Mən ölümdən qorxmuram, ancaq məni o dünyaya xəyanətkar kimi, bişərəf kimi göndərmə, ya rəbb!* İ.Məlikzadə.

**XƏYANƏTKARLIQ** *is.* Xəyanət etmə, xainlik etmə; xainlik.

**XƏYYAT** *is.* [*ər.*] *köhn.* Dərzi. *Xəyyat bizim əhldən 1-2 nəfərdir ki, çuxa şalvarlardan alahı libas tikmirlər, amma palto, kürk və qeyri libasları tikənlər erməni, rusdurlar ki, yaxşı pul alırlar.* "Əkinçi". *Ağ alaçıq, əlvan çadır; Naxış vurubdu xəyyatı.* Aşıq Ələsgər.

**XƏZ** *is.* 1. Xəzli heyvanların bədənini örtən tük örtüyü; yun. *Dələ xəzi.* // Bu cür heyvanların işlənmiş, aşılanmış dərisi. *Xəz ticarəti. Xəz tədarükü. – Hər il ovçular yüz milyon manatlarla qiyməti olan xəz dəri, piy, ət, quş tükü və s. məhsul əldə edirlər.* M.Rzaquluzadə.

2. Xəzdən tikilmiş, xəzdən hazırlanmış. *Xəz papaq. Xəz yaxalıq. – Kişi çıxardı ki, ağaya yüzlüklər bəxş edərdi, atlar, inəklər vəd edərdilər; ipək abalar, xəz cübbələr verilərdi..* Çəmənzəminli. [Hacı Saleh:] *Amma onun atasının sən çöldə qalmışı öz oğlu kimi xəz paltolu saxladığı hamıya məlumdur.* S.S.Axundov. [Fatma] *xəz palto geyib, başına və boynuna qalın yun şərf bağlamışdı.* M.İbrahimov.

**XƏZAN** *is.* [*fars.*] Payızda yarpaqların tökülməsi; yarpaq tökülmə mövsümü; payız. *Ərağac zəmilər payızın xəzanına bir bəzək və zinət verirdi.* S.Rəhimov. *Nə tez xəzan görür çöllər, çəmənlər; Arzular sərt daşa dəyir dünyada; Axşam kor-peşman evə dönənlər; Yaxşı ki səhər var, – deyir, – dünyada.* N.Xəzri. // *məc.* Gənclik təravətinin getdiyi dövr.

**XƏZÇİ** *is.* Xəz hazırlayan usta; dəriçi. *Xəzçilər belə hazırlanmış dəriləri növlərə ayırır, nöqsanlarını düzəldir, sonra onları bir-birinə uyğunlaşdıraraq biçib, geyim halına gətirirlər.* "Əmtəəşünaslıq".

**XƏZƏL** *is.* 1. Payız fəslində budaqlardan tökülən (saralmış) quru yarpaqlar. *Qaratoyuq tutmaq üçün at qılından cələ hörüb bağda ağaclar altında çox xəzəl olan yerdə qurardıq.* S.S.Axundov. *İlyas qızın ayaqları yanında, keçənilki quru xəzəllər üstündə oturub qolunu daşa söykədi.* Ə.Məmmədxanlı. □ **Xəzəl olmaq, xəzələ dönmək** – saralıb-solmaq, qurumaq. *Payızdır, bağçalar*

*xəzələ dönmüş; Təbiət bir solğun gözələ dönmüş.* M.Müşfiq. *Niyə xəzəl oldu salxım söyüdlər; Harda görüşəcək sevənlər indi?* N.Xəzri. // Məc. mənada. *Özü xəzəl olub vaxtsız töküldü; Ömrün baharını duymadı, getdi.* S.Vurğun. *Səni görmədən ölsəm; Xəzəl olub tökülsəm; Dadlı bahar çağımda.* M.Müşfiq. *Ömrünün bağçası döndü xəzələ. Biinsaf, bivəfa, yar dedi, getdi.* M.Rahim. **Xəzəl kimi** – solğun, solğunlaşmış, təravətini itirmiş. [Fərman Mələyə:] *Bir-iki ildən sonra da xəzəl kimi saralıb solacaqsan.* M.İbrahimov. *Əjdərin üzü xəzəl kimi saralmış və solmuşdu.* S.Rəhman. *Budaqda titrəyən son xəzəl kimi; Elə bil ümiddən asılıb ürək...* N.Kəsəmənli.

2. Müqayisələrdə çoxluq, hədsizlik, saysızlıq bildirir. [Bibixanım:] *Pul əlində elə bil Şüvəlan bağlarının xəzəlidir.* B.Bayramov. ☐ **Xəzəl kimi yağdırmaq (səpələmək, tökmək)** – sağa-sola xərcləmək, israfçılıq etmək. [Fatmanisə Seyidə:] *..Dua yazdıran kimdir, ruh tutduran kimdir, nəzir də ki xəzəl kimi başından aşağı pulu yağdırırlar.* R.Əfəndiyev. **Xəzəl kimi yağmaq (səpələnmək, tökülmək)** – həddindən artıq, çoxlu, saysız-hesabsız gələn pul haqqında. *Onluqdan tutmuş yüzlüyə qədər pullar sazın üstünə xəzəl kimi töküldü.* B.Bayramov.

**XƏZƏLLƏNMƏ** "Xəzəllənmək"dən *f.is.*

**XƏZƏLLƏNMƏK** b a x **xəzəlləşmək**.

**XƏZƏLLƏŞMƏ** "Xəzəlləşmək"dən *f.is.*

**XƏZƏLLƏŞMƏK** *f.* Xəzəl olmaq, xəzələ dönmək, saralıb qurumaq, solmaq.

**XƏZƏLLİ** *sif.* Xəzəl tökülmüş, xəzəllə dolu, xəzəllə örtülü, çoxlu xəzəl yığılmış. *Xəzəlli cığır. Xəzəlli yol. Xəzəlli bağlar. – Xəzəlli dərələr aşağı buz kimi sular şırıltı ilə axırdı.* S.Rəhimov.

**XƏZƏLLİK** *is.* Çoxlu xəzəl tökülmüş, xəzəl yığılmış, xəzəllə örtülmüş yer. *Xəzəllikdə dayanmaq. Xəzəllikdə atı saxlamaq.*

**XƏZƏRLƏR** *cəm tar.* V–X əsrlərdə Aşağı Volqadan Qafqaza və Qara dənizin şimal hissəsinə qədər olan ərazidə dövlət qurmuş türkdilli xalq.

**XƏZİNƏ, XƏZNƏ** *is.* [*ər.*] 1. Pul, cavahirat və s. qiymətli şeylər saxlanılan yer. *Cümə axşamları ağanın xəzinəsindən füqəraya pul paylanardı.* Ə.Haqverdiyev.

2. Bir dövlətə məxsus pul, sərvət, torpaq və s. qiymətli vəsaitin hamısı birlikdə. *Dövlət xəzinəsi. Xəzinəyə məxsus torpaqlar. Xəzinə malı. – ..Uşqolların xərci dövlət xəzinəsinin öhdəsində idi.* C.Məmmədquluzadə.

3. *məc.* Mədəni və mənəvi sərvətlərin toplusu. *Türk dilində, Azərbaycan şivəsində təzə bir kitabın ədəbiyyat xəzinəmizə daxil olmasını kəmali-iftixar ilə izhar edirik.* F.Köçərli. *Onlar böyük bir səy ilə xalqının qəhrəmanlıq tarixinə yeni səhifələr yazmış, ya da elm və sənət xəzinəsini parlaq incilərlə zənginləşdirmişlər.* M.İbrahimov.

4. Köhnə Şərq hamamlarında isti su saxlanılan yer, hovuz. [Xortdan:] *Bizim hamamların İran qaydası böyük hovuzları var ki, adına xəzinə deyirlər.* Ə.Haqverdiyev. *Ancaq tağların birinin altında xəzinə olardı. Orada isti su saxlanılardı.* H.Sarabski. [Rza bəy:] *Əşi, girirəm xəzinəyə, bilmirəm ki, bu içində çimdiyim sudur, neftdir, həlimdir, yoxsa bozbaşdır.* Ü.Hacıbəyov.

5. Keçmişdə tapançada dəstəyin, tüfəngdə qundağın dibçəyində, müasir silahlarda isə patron qoyulan yer. [Həcər] *tüfəngi əlinə götürüb onun xəzinəsini açır, diqqətlə buraya baxır və yoxlayırdı.* S.Rəhimov.

◊ **Xəzinə üstündə oturmaq** – çoxlu pul, var-dövlət sahibi olan adam haqqında. [Hacı Murad:] *Haradan alım? Deyəsən, xəzinə üstündə oturmuşam.* S.S.Axundov.

**XƏZİNƏÇİ** *is.* Xəzinə işçisi, xəzinədar.

**XƏZİNƏDAR** *is.* [*ər.* xəzinə və *fars.* ...dar] 1. *köhn.* Xəzinəyə nəzarət edən məmur.

2. Hər hansı bir müəssisənin, cəmiyyətin, təşkilatın pul və qiymətli şeylərini qoruyan, pul işlərinə baxan adam; xəzinəçi. *Bəli, indi qəzetlərdə Bakı cəmiyyəti-xeyriyyəsi elan edir ki, cəmiyyətə üzv olmaq istəyənlər 5 manatlarını gətirib versinlər cəmiyyət xəzinədarına və qəbzlərini alsınlar.* C.Məmmədquluzadə. [Çingiz:] *İndilik iki adam bəsdir. Xəlil, sabahın pulunu xəzinədardan istə.* Çəmənzəminli.

**XƏZİNƏDARLIQ** *is.* Xəzinədar vəzifəsi, xəzinəçilik. *Həsən dayısını .. xəzinədarlığa düzəltdi.* Qantəmir.

**XƏZLİ** *sif.* Xəzi olan, xəz qoyulmuş, xəz tikilmiş; yaxası xəzdən olan. [Pərşanın]

*əynində xəzli qara palto, başında sarı yun şal, ayağında işıldayan uzunboğaz botu vardı.* M.İbrahimov.

**XƏZLİK** *is.* və *sif.* Xəzə yarar, xəz üçün olan. *Xəzlik dəri. Xəzlik heyvan cinsi.*

**XƏZRİ** *is.* Abşeron yarımadasında şimaldan əsən şiddətli külək. *..Xəzri hardansa buludları qovub gətirmiş, Bakını şiddətli və qısa yağışla sulayandan sonra, birdən xırp kəsilmişdi.* M.Hüseyn. *Elə bil dəhşətli bir xəzri əsdi, onsuz da dalğalanan dənizi daha da coşdurdu.* S.Rəhman.

**XIX: xıx eləmək**, *uş. zar.* – başını kəsmək. [Tapdıq:] "*Dovşanın başını xıx elə*" – *deyib atanın üzünə baxdı.* Ə.Vəliyev.

**XIXILDAMA** "Xıxıldamaq"dan *f.is.*

**XIXILDAMAQ** bax **xırıldamaq** 1-ci mənada. *Geyinməyə ayrı bir libasın yoxdur, Mirzə, – deyə Müqimbəy boğazında xıxıldaya-xıxıldaya güldü.* S.Rəhimov.

**XIXIR(T)MA** "Xıxır(t)maq"dan *f.is.*

**XIXIR(T)MAQ** *f.* "Xıx-xıx" deyərək dizi üstə çökdürmək, oturtmaq. *Dəvəni xıxırtmaq. Qoyunu xıxırtmaq.* – [Pristav:] *Tatarlar deyirlər ki, qonaq ev sahibinin dəvəsidir, harda istəsə orda xıxırdar.* Ə.Abasov.

**XIXLANMA** "Xıxlanmaq"dan *f.is.*

**XIXLANMAQ** *məch.* Diz üstə çökdürülmək, oturdulmaq. *Məşədi Kazım ağa .. xıxlanmış* (f.sif.) *dəvə kimi dizləri üstündə yerə çökdü.* M.S.Ordubadi.

**XILXA** *sif.* və *is.* Geyməyə və ya işlətməyə yaramayan; gərəksiz, yıpranmış, köhnə, cəm-cındır. *Xılxaları yığıb atmaq.* – *Kərimbəy istəyirdi ki, Azərbaycan kəndləri də .. köhnə xılxadan çıxsın.* Mir Cəlal.

**XILXIN** *sif.* Sınıq, əzik, sınıq-salxaq, yararsız. *Xılxın qab-qacaq. Xılxın ev əşyası.* – *Nəcəf xılxın nərdivanla dama qalxdı.* Q.İlkin.

**XILT** *is.* 1. Hər hansı məhlulun, mayenin qabın dibinə çökən və ya ondan ayrılan lazımsız hissəsi. *Yağın xıltı. Sirkənin xıltı.* – *Avtomobil 300 km yol getdikdən sonra süzgəcdə olan xıltı boşaltmaq və gövdəni yumaq lazımdır.* Ə.Əliyev.

2. *məc.* Olub keçmiş bir hadisədən, işdən sonra insanda iz buraxan xoşagəlməz, ağır hiss, təəssürat. *Dincəlmək, nə isə daxilində daş kimi yatan, xılt kimi çöküb qalan anlaşılmaz və dumanlı təəssüratı unutmaq üçün* [Firidun] *tək-tənha küçələri dolanmağa başladı.* M.İbrahimov.

**XILTA** bax **xalta**. *Ova aparılan bu tazıların boynunda xılta olardı.* H.Sarabski.

**XILTALI** bax **xaltalı**.

**XILTLI** *sif.* Dibinə xılt çökmüş, xıltı olan. *Xıltlı məhlul.*

**XIMXIRT** *is.* Lazım olan, yararlı xırda şeylər. *Xımxırt almaq. Xımxırtını bir yerə yığmaq.*

**XIMIRÇƏK** *is. anat. fiziol.* Heyvan və insan orqanizmi skeletinin bəzi hissələrini birləşdirən elastiki və möhkəm toxuma.

**XIMIR-XIMIR** *zərf dan.* 1. Yavaş-yavaş, alçaqdan, sakit-sakit, yavaşdan, özü üçün. [Araz:] *O xımır-xımır, pəsdən oxuyan kim idi? – deyə soruşdu.* A.Şaiq.

2. Az-az, azca-azca, tədriclə. *Xımır-xımır nə yeyirsən?*

**XINA** *is.* Saçı (keçmişdə, habelə köhnə adətcə barmaqları, əlləri, saqqalı) boyamaq üçün işlədilən, həmin bitkinin yarpaqlarından hazırlanan toz halında sarımtraq-qırmızıyaçalar maddə; həna. *Molla Qurban .. barmaqlarına fındıqça xına yaxmışdı..* M.S.Ordubadi. [Qulu:] *Gözümdə qaldı, bir gün oturub saqqalıma xına yaxım.* N.Nərimanov. [Vidadi:] *Gedək xına qoyaq əllərimizə; Uşaq bizimkidir, mübarək olsun!* S.Vurğun.

◊ **Bu xına o xınadan deyil, bu xına o xınaya oxşamır** – vəziyyətin, şəraitin tamamilə kəskinləşdiyini, ağırlaşdığını, əvvəlkinə oxşamadığını bildirən ifadə. [Tahir yoldaşlarına:] *Bərk hazırlaşın, bu xına o xınadan deyil.* M.Hüseyn. [Hacının oğlu:] *Ağa can, sənə deyirəm, öz hörmətini saxla, yoxsa, bu xına o xınalara oxşamır.* P.Makulu.

**XINAÇİÇƏYİ** *is. bot.* Parlaq çiçəkləri olan bir sıra birillik bəzək bitkilərinin adı; balzamin.

**XINAGÜLÜ** bax **xınaçiçəyi**.

**XINAQOYMA** *is. etnoqr.* Toydan qabaq ərə gedən qızın başına, əl-ayağına xınayaxma (qoyma) adəti. *Kiçikbəyimi tay-tuşu ilə bərabər gəlin hamamına apardılar, sonra qaşalma və xınaqoyma oldu.* Çəmənzəminli.

**XINALAMA** "Xınalamaq"dan *f.is.*

**XINALAMAQ** *f.* Saça (ələ, saqqala) xına qoymaq. *Əlini xınalamaq. – Molla Qurban .. nazik saqqalını təzəcə xınalamışdı.* M.S.Ordubadi.

**XINALANMA** "Xınalanmaq"dan *f.is.*

**XINALANMAQ** *f.* Xına qoyulmaq, xına yaxılmaq.

**XINALATMA** "Xınalatmaq"dan *f.is.*

**XINALATMAQ** *f.* Xına qoydurmaq, xına yaxdırmaq. *Ayağını xınalatmaq. Barmaqlarını xınalatmaq. – ..Saçlarını xınalatmış* (f.sif.), *qaş-gözünü təbii görünəcək qədər zərif bir şəkildə düzəltdirmiş Qəmər xanım danışdı..* M.İbrahimov.

**XINALI** *sif.* 1. Xına çəkilmiş, xınalanmış, əl-ayağına xına qoyulmuş. *Xınalı barmaqlar. – ..Dükan-bazar boyalı yumurtalar, rəng-arəng parçalar, əli-ayağı xınalı adamlarla dolmuşdu.* M.İbrahimov. *Manqalın işığında qadının xınalı dırnaqları və barmağındakı qızıl üzük işıldadı.* İ.Hüseynov.

2. Xınaya bulaşmış, xına dəymiş. [Münəvvər xanım:] *Mənim də o xınalı baş dəsmalımı götür, sabunla isti suda yu.* Mir Cəlal.

**XINAYAXDI** b a x **xınaqoyma**.

**XINAYI** *sif.* Xına rəngində olan, xına rənginə oxşar. *Xınayı parça. – Gedim, deyirəm, camaatın dəmirin oda qoyum.. Əsgərlərimiz üçün bir az buğda yığaq... Arabir gələndə o biri xınayı çuval var ha, onu verərsiz, aparalar.* Ə.Əbülhəsən. *Lətif, yazı stoluna dirsəklənib barmaqları ilə xınayı saçını daraqlamış Mərdanovanın ona dikilmiş düşüncəli gözlərində .. böyük bir qayğı hiss etmişdi.* H.Seyidbəyli.

**XINCAXINC** *sif.* Ağzınacan. *Xıncaxınc dolu çamadan.*

**XINC-XINC** b a x **xıncım-xıncım**. *Bizdən sora kəndlilər Pəri arvadı və uşağını xarabadan çıxartmışdılar. Ancaq biçarə arvadın sağ qılçası dizdən yuxarı xınc-xınc olmuşdu.* C.Məmmədquluzadə.

**XINCIM-XINCIM** *zərf* Tikə-tikə, xırda-xırda, qırıq-qırıq, parça-parça. *Şüşə xıncım-xıncım olub töküldü. –* [Mindilli:] *Yaxşı ki, atmağa qoymadın, yoxsa xıncım-xıncım olardı.* S.Rəhman. *İndi hər iki təyyarə elə bir sürətlə üz-üzə gəlirdi ki, ikisindən biri qaçmazsa, hər ikisi xıncım-xıncım olacaqdı.* M.Rzaquluzadə. ◻ **Xıncım-xıncım etmək (eləmək)** – tikə-tikə etmək, qırıb tökmək. *Qəlpə onun sümüklərini xıncım-xıncım etmişdi.* H.Seyidbəyli.

**XINCLANMA** "Xınclanmaq"dan *f.is.*

**XINCLANMAQ** *f.* Tikə-tikə olmaq, qırıq-qırıq olub tökülmək, sınıq-sınıq olmaq. *Pəncərələr xınclanıb töküldü.* Ə.Cəmil.

**XIR**[1] *is.* Bostan. *Zəmilər işlənir, toxum səpilir; Qız, qadın əlləşib əkirlər xır.* M.S.Ordubadi. *Qurbanqulu çox iş sevən bir cavan idi. Sübh hamı qonşularından ertə durub oduna, biçinə, alağa, xıra, bağa gedərdi.* T.Ş.Simurq.

**XIR**[2] *is.* Yiv (tüfəngdə, topda, tapançada). *Tüfəngin xırı gedib.*

**XIRA** *is.* Dəyməmiş, kal yemiş, qovun.

**XIRÇAXIRÇ** *zərf* Adətən dolmaq, doldurmaq feilləri ilə – tamam, ağzınacan. *Kisəni xırçaxırç doldurmaq. – Oturanlar oturmuş, asılanlar asılmış, vaqonlar xırçaxırç dolmuşdu.* Qantəmir.

**XIRÇI** *is.* Bostançı.

**XIRÇILDAMA** "Xırçıldamaq"dan *f.is.*

**XIRÇILDAMAQ** *f.* Xırçıltı səsi çıxartmaq, xırç-xırç eləmək. *Yalnız ayaqlarımızın altında xırçıldayan çınqılların şikayətini andıran həzin səslər eşidilirdi.* S.Hüseyn. *Söz arasında mənə ərəb kəlməsi, farsi lüğəti rast gələndə elə bilirəm çörək yeyəndə dişimin altında xırdaca daş parçası qalıb xırçıldayır.* Qantəmir. *At yeriyir, arabanın təkərləri daşlı yolda bərk xırçıldayırdı.* Q.İlkin.

**XIRÇILDATMA** "Xırçıldatmaq"dan *f.is.*

**XIRÇILDATMAQ** *f.* Bir-birinə toxundararaq xırçıltı səsi çıxartmaq.

**XIRÇILTI** *is.* İki bərk şeyin (metal, sümük və s.-nin) bir-birinə toxunmasından çıxan səs. *Otaqda tükürpərdici bir xırçıltı eşidildi.* P.Makulu.

**XIRÇIN** *sif.* Çox inadkar, tərs, şıltaq. *Xırçın adam. – Yeni on dörd yaşa girmişdi bu yaz; Sarışın, nəşəli, xırçın Gülnaz.* M.Müşfiq. // Məc. mənada. *..Dənizin ta göbəyindən qopub gələn xırçın dalğalar fırtınaya tutulmuş gəmini bir top kimi atıb tuturdu.* A.Şaiq.

**XIRD** b a x **xirid**. ◻ **Xırd eləmək** – satmaq. [Abbas:] *Bəzirgansan, aç mətahın xırd*

*elə; Qarğalar yükündə nə var deyərlər.* "Abbas və Gülgəz".

**XIRDA** *sif.* 1. Həcmcə, ölçücə, boyca kiçik, balaca. *Xırda boy. Xırda əl. Xırda həb. Xırda daş. – ..Zeynal özü ilə ancaq xırda bir dəftərçə götürdü..* B.Bayramov. // Addım haqqında. *Əlində qəhvəyi rəngli kiçik redikul, xırda və yeyin addımlarla gedən Lətifə başını yuxarı qaldıranda Tahiri gördü.* M.Hüseyn.

2. Yaşca kiçik, balaca. *Xırda qız. Xırda uşaqlar. – Mən İrəvana çatan kimi Hacının xırda oğlu Məşədi Ələkbər çıxdı qabağıma və zor ilə məni apardı evlərinə.* C.Məmmədquluzadə. *Camaatın içərisində Cavadın diqqətini cəlb edən xırda, sarışın bir oğlan uşağı var idi.* Ə.Vəliyev. *Bir dəstə xırda uşaq Kamili araya aldı.* M.Süleymanov.

3. *məc.* O qədər də əhəmiyyəti olmayan, diqqəti cəlb etməyən, ikinci dərəcəli, cüzi. *Əvvələn, xırda işlərdən ötrü suda düşən işlər və yüngül tənbehlərin hamısı manifestə düşür.* C.Məmmədquluzadə. [Leyla:] *Xırda hisslərlə yaşayan insan min il yaşasa da elə kölgədir.* B.Vahabzadə.

4. Maddi imkanları az olan, iqtisadi cəhətcə zəif. *Xırda mülkiyyətçi. Xırda təsərrüfatlar. Xırda müəssisələr.*

5. Yüksək, ictimai və ya xidməti vəzifə tutmayan. *Xırda məmur. O, idarədə xırda bir vəzifədə çalışır.*

6. Yüngülvari, cüzi. *Xırda alver.* – [Məlikin] *atası xırda alverçi idi..* M.İbrahimov. *Aşağı bazarda xırda alış-verişçilər, baqqallar, dərzi və papaqçılar yerləşmişdi.* H.Sarabski.

7. *İs. mənasında.* Xırda pul (metal ağ və ya qara pul). *Zahidoğlu əlini uzadıb xırdanı götürdü və yavaşca cibinə atdı.* S.Rəhimov. [Təmraz:] *Mehralı, sən zəhmət çəkmə, məndə xırda var.* S.Rəhman. [Nəcəf bəy Cavanşir bəyə:] *Sən* [Bəhruza] *nə qədər vermişdin ki, o sənə bu qədər xırda qaytarmışdır.* Ə.Məmmədxanlı.

**XIRDABOY(LU)** *sif.* Boyu xırda, balaca, alçaq. *Xırdaboylu qız.*

**XIRDABUYNUZ(LU)** *sif.* Buynuzları xırda, kiçik (qoyun, keçi və s.). *Xırdabuynuzlu heyvanlar.*

**XIRDACA** *sif.* 1. Çox xırda və ya bir qədər xırda; kiçikcə. *Xırdaca təpə. Xırdaca göllər. Xırdaca əl. – Təllin ətəyindən bir xırdaca çay axırdı. Bu çayın kənarı gözəl bir çəmən idi.* Ə.Haqverdiyev. *Balaca şəhərin küçələrini duman bürümüşdü. Xırdaca evlər duman kimi görünürdülər.* Çəmənzəminli. *Kəndin kənarından getgedə sıxlaşan və iriləşən xırdaca qamışlıq başlanırdı.* M.Rzaquluzadə.

2. Azyaşlı, kiçik, balaca. *İndi səkkiz il idi ki, muzdur Məşədi Əsgər Qanlıtəpədə bir arvadı və üç baş xırdaca uşaqları ilə ayda iyirmicə manat məvacibə qənaət edib dolanırdı.* S.M.Qənizadə.

3. Cılız, balaca, nəzəri cəlb etməyən. *Qafar yaşı əlliyə yaxın olan xırdaca, arıq bir adamdı.* Ə.Əbülhəsən. [Rəşid:] *Bu arıq, xırdaca adamın buğlanan çay stəkanını ehtiyatla stolun küncünə uzadan azacıq titrək əlini görürdüm.* İ.Hüseynov.

4. *məc.* Nərmənazik, incə, zərif. *Sallanıban yüz nazıla; Gələn kimin yarıdı bu? Qəddü-qamət nə qiyamət; Xırdaca dilbərdi bu.* Aşıq Məhəmməd. *Naz ilə gəldin otağa; Leyli nişan, xırdaca qız!* Aşıq Əsəd.

**XIRDACA-XIRDACA** 1. *zərf* Yavaş-yavaş, az-az, ahəstə-ahəstə, aramla. *Xırdaca-xırdaca yağar yağışlar; Vurğun Səməd bu dövranı alqışlar.* S.Vurğun. *Bayır tərəfdən divarların dibi ilə uzanan sərv ağacları yenə də yavaş-yavaş tərpənir və qırmızı taxtapuşu xırdaca-xırdaca dınqıldadırdı.* S.Rəhimov.

2. *sif.* Kiçik-kiçik, balaca-balaca (çoxluq bildirir). *Xırdaca-xırdaca uşaqlar.* – [Nərgiz qocaya:] *Amma* [anamın] *göy donunun üstündə xırdaca-xırdaca çoxlu ağ çiçəklər var.* Ə.Məmmədxanlı.

**XIRDAÇI** *sif.* Xırda, əhəmiyyətsiz, boş şeylərə həddən artıq əhəmiyyət verən, bu işdə ifrata varan; pedant. *Xırdaçı adam. – Köməkçi Xanqulunu itələyib: – Ə, Xanqulu, az xırdaçı ol, – dedi.* S.Rəhimov. *Bizi ki, sarsıtmaz afaqı səbəblər; Çünki biz; Xırdaçı deyiliz.* M.Müşfiq.

**XIRDAÇILIQ** *is.* Xırdaçı adamın xasiyyəti; pedantlıq. *Dəmirov istəyirdi ki, bəzi adamların xırdaçılığından danışıb onları təhsilə, savada və mütaliəyə çağırsın.* S.Rəhimov.

[Həmzə] *indi xırdaçılıq adı verdiyi bu işin də faydasız olacağını hiss edirdi.* Ə.Əbülhəsən.

**XIRDADƏNƏLİ** *sif.* Dənələri xırda olan. *Xırdadənəli arpa.*

**XIRDADƏNƏVƏR(Lİ)** b a x **xırdadənəli**.

**XIRDADİŞ(Lİ)** *sif.* Dişləri xırda olan. *Xırdadiş balıq.*

**XIRDAGÖVDƏ(Lİ)** *sif.* Gövdəsi balaca, xırda olan. *Xırdagövdəli bitki.*

**XIRDAGÜL(LÜ)** *sif.* Gülləri xırda, balaca olan; xırda naxışlı. *Xırdagül çit. Xırdagüllü ipək.*

**XIRDA-XIRDA** 1. *zərf* Yavaş-yavaş, ahəstə-ahəstə, ağır-ağır, aramla. [Qız] *hala gəlib, xırda-xırda yataqdan qalxıb yerində oturdu və yemək istədi.* (Nağıl). *Qıraq tərəfdəki qazmada balaca şam xırda-xırda yanır, kiçik alov burula-burula qalxırdı.* S.Rəhimov. *Basdı qədəmlərini qum üstə xırda-xırda.* B.Vahabzadə.

2. *sif.* Kiçik-kiçik, balaca-balaca (çoxluq bildirir). *Xırda-xırda ağaclar. Xırda-xırda komalar. – Çox əziyyət ilə saqqalından xırda-xırda kağız parçalarını qoparırdı.* Ə.Haqverdiyev. *Gülərüzlü bir qadın tez; Qarşıladı qonaqları; Vardı onun bir-birindən; Xırda-xırda uşaqları.* M.Dilbazi. *Mamırlı daşları üzə çıxan çay qolunda, xırda-xırda gölməçələrdə parlaşan qızıl balıqları gördükdə Qoşqar dünyada hər şeyi unudardı.* İ.Hüseynov.

**XIRDA-XURUŞ** 1. *is.* Hər cür xırda şeylər, xırdavat. *Xırda-xuruş almaq. – Laçın iki aydan bəri görmədiyi qəsəbənin ayrı-ayrı evlərinə, dükanlarına, xırda-xuruşla bəzənmiş vitrinlərinə baxa-baxa gedirdi.* M.Hüseyn.

2. *sif.* Xırda, kiçik, əhəmiyyətsiz. *Evdə xırda-xuruş söz-sov olar. – Cümrü Ağamalının əhəmiyyəti onun bu xırda-xuruş işlərində deyildi.* H.Sarabski. *Arvad xeylağı heç boş durmağı sevməz, evin yüzlərcə və qurtarmaq bilməyən xırda-xuruş işləri ilə bütün gün məşğul olub durur.* Qantəmir. *Bu xırda-xuruş pıçıltılardan sonra yenə sükut edib yad adama tamaşa etməyə başladıq.* S.Rəhman.

**XIRDAKI** *is.* Xırdalanmış, bölünmüş düyü; xırda düyü. *Dolmaya xırdakı qatmaq.*

**XIRDALAMA** "Xırdalamaq"dan *f.is. Dərman bitkilərinin tədarükü işi aşağıdakı: toplama, qurutma, xırdalama, saxlama və qablama mərhələlərindən keçir.* R.Əliyev.

**XIRDALAMAQ** *f.* 1. Bıçaq və ya başqa kəsici alətlə bir şeyi xırda-xırda eləmək, doğramaq, kəsmək, parçalamaq. *Əti çəkmək üçün xırdalamaq. Pendiri xırdalamaq. – ..Ətyeyən heyvanın, məsələn, pişiyin dişlərinin hamısı iti bıçaq kimidir. Çünki əti doğramaq, yəni kəsmək ilə xırdalamaq olur.* H.Zərdabi. [Nisə xala:] *Xanlar, quzunu xırdalama, quyruğu da qoy üstündə qalsın.* Qantəmir.

2. İri pulu öz qiymətinə bərabər olan xırda (kağız və ya metal) pulla dəyişmək. *Yüzlüyü xırdalamaq.*

3. *məc.* Fikri açmaq, təhlil etmək, izah etmək. *Sözü xırdalamaq. – Gəlin, bu sözləri xırdalayaq və görək, bu qısa cümlənin arxasında nə gizlənir?*

**XIRDALANMA** "Xırdalanmaq"dan *f.is.*

**XIRDALANMAQ** 1. *məch.* Xırda-xırda edilmək, doğranmaq, tikə-tikə edilmək.

2. *t-siz.* Parça-parça olmaq, xırda-xırda olmaq, tlkə-tikə olmaq; ovxalanmaq. *Səhərdən bəri lopa-lopa yağan qar indi xırdalanıb şəkər kimi ələnirdi.* B.Bayramov.

3. *məch.* Öz qiymətinə bərabər xırda (kağız və ya metal) pulla dəyişilmək (iri pul).

4. *məc.* Kiçilmək, cılızlaşmaq, əvvəlki bütövlüyünü, dolğunluğunu itirmək. *Ot bitər kökü üstə; Yalanmış, bu yalanmış; Babək nəsli gör bu gün; Necə də xırdalanmış!* B.Vahabzadə.

**XIRDALAŞDIRILMA** "Xırdalaşdırılmaq"-dan *f.is.*

**XIRDALAŞDIRILMAQ** *məch.* Kiçildilmək, balacalaşdırılmaq.

**XIRDALAŞDIRMA** "Xırdalaşdırmaq"dan *f.is.*

**XIRDALAŞDIRMAQ** *f.* Kiçiltmək, balacalaşdırmaq.

**XIRDALAŞMA** "Xırdalaşmaq"dan *f.is.*

**XIRDALAŞMAQ** *f.* Balacalaşmaq, kiçilmək, xırda olmaq. *Onun yuxusuzluqdan xırdalaşıb qızarmış gözləri dostlarının üzündə gəzir, elə bil onların qəlbinə nüfuz edirdi.*

M.Hüseyn. *Əlikram stolun arxasında yastılanmışdı, yamanca xırdalaşmışdı.* B.Bayramov.

**XIRDALAYICI** *is.* Bir şeyi xırdalayan, doğrayan maşın. // Sif. mənasında. *Xırdalayıcı maşın. – Bitki materialını toz halına salmaq üçün müxtəlif növ dəyirmanlardan və mürəkkəb quruluşlu xırdalayıcı maşınlardan .. istifadə edilirdi.* R.Əliyev.

**XIRDALƏÇƏK** *is. bot.* Rütubətli yerlərdə bitən, gövdəsində və yarpaqlarında aşı maddəsi olan bitki. *Xırdaləçək .. zibilliklərdə, rütubətli yerlərdə bitir. Gövdələri və yarpaqlarında aşı maddəsi vardır.* M.Qasımov.

**XIRDALIQ** *is.* Həcmcə, ölçücə, boyca xırda olma; balacalıq, kiçiklik. *Naxışların xırdalığı. Əlin xırdalığı.* // Balacalıq, kiçiklik (yaşca). *Xırdalığına, həm də çox çevikliyinə görə "Ciniş" ləqəbini qazanmış oğlan pərt idi.* Ə.Əbülhəsən.

**XIRDAMEYVƏ(Lİ)** *sif.* Meyvələri xırda, kiçik olan (gilənar, qarağat və s.). *Xırdameyvə ağaclar.*

**XIRDA-MIRDA** b a x **xırdavat**. *Xırda-mırda satmaq.*

2. *top.* Hər cür xırda şeylər. *Xırda-mırdanı bir küncə yığmaq.* // Sif. mənasında. *Keşiş xırda-mırda ev şeylərini satıb köçünü yüngül elədi.* "Əsli və Kərəm".

3. Az, cüzi. *Xırda-mırda xərclik.* – [Serjant:] *İki tümən də xırda-mırda xərcim çıxmışdı.* P.Makulu.

4. Kiçik, əhəmiyyətsiz. *Altıncı da xırda-mırda oğurluq eləyənlərdir ki, manifestə düşüb azad olublar.* C.Məmmədquluzadə.

**XIRDA-PARA** *sif.* 1. Xırda, kiçik. *Köç vaxtı, özün bilirsən ki, xırda-para şeylər çox olur və tərəkəmə əhlində də insaf olmaz, əlinə hər nə gəlsə, ağırlığına, yüngüllüyünə baxmayıb, atır dilsiz-ağızsız heyvanın üstə..* F.Köçərli. [Hacı Novruz:] *Xırda-para mülk sahibləri hamısı bizim tərəfimizdə olacaqlar.* Ə.Haqverdiyev. // *İs. mənasında*. Xırda, kiçik şey və s. [Kərbəlayı Məhəmmədvəli:] *Ancaq bu qış səkkiz camışım, on dörd inəyim, xırda-paradan başqa, tələf olubdur.* N.Vəzirov.

2. *məc.* Əhəmiyyətsiz, cüzi, kiçik. *İndiyə qədər də* [Meşinovun] *xırda-para işlərdə ilişib qalmağı yalnız müvəqqəti bir haldır.* S.Rəhimov. [Nazlı:] *Ancaq, Rövşəncan, bizim burada bəzi xırda-para işlərimiz var.* S.Rəhman.

**XIRDASÜNBÜL(LÜ)** *sif.* Sünbülləri xırda, balaca. *Xırdasünbüllü taxıl.*

**XIRDAVAT** *is.* Metaldan, sümükdən, dəridən və s.-dən hazırlanan xırda şeylər (kəmər, düymə, daraq və s. kimi). [Kişi:] *Əldə xırdavat satmağa üç yüz manat pul düzəldib buraya gəldim ki, mal alıb aparam.* S.S.Axundov. [Kişinin] *xırdavat satmağından və uzun saqqalından şübhələnmişdilər.* Mir Cəlal.

**XIRDAVATÇI** *is.* Xırdavat mallar satılan yer. *Xırdavatçı dükanı.* // Xırdavat satan adam. [Cavanşir bəy Nəcəf bəyə:] *Mənə xırdavatçılar süfrəsindən pay lazım deyil.* Ə.Məmmədxanlı.

**XIRDAVATÇILIQ** *is.* Xırdavatçının işi, peşəsi. *Xırdavatçılıq eləmək.*

**XIRDAYARPAQ(LI)** *sif. bot.* Yarpaqları xırda olan. *Xırdayarpaqlı kol. Xırdayarpaqlı ağac.*

**XIRDIM-XIRDIM** b a x **xıncım-xıncım**. [Salam dayı] *ayna tək parıldayan başını aşağı dikib eynəyinin üstündən içəri girmiş adama baxdı. Eynəyinin şüşələri xırdım-xırdım olmuşdu.* Q.İlkin.

**XIRXALAMA** "Xırxalamaq"dan *f.is.*

**XIRXALAMAQ** *f.* Ayağının altına salıb əzmək, əzişdirmək; xırpalamaq. [Kəndlilər] *ho... ho... ho – deyib baxmağa başladılar. – Əgər cöngə kişini xırxalayıb öldürməsə?!* S.Rəhimov.

**XIR-XIR** 1. *sif.* Səsi xırıltılı. *Xırxır adam. – Bu çolaq, xır-xır qocanı görəsən niyə cəzalandırmışlar?* S.Vəliyev.

2. *is.* Xırıltılı səs, xırıltı. *Ancaq yabana hürən köpəklərin xır-xırı, hürüşü kəsmə-kəsmə eşidilirdi.* S.M.Qənizadə.

**XIRILDAMA** "Xırıldamaq"dan *f.is.*

**XIRILDAMAQ** *f.* 1. Aydın olmayan, boğuq, tutqun səs çıxarmaq; xırıltı səsi çıxarmaq. *Ölmək ölməkdir, xırıldamaq nə deməkdir.* (Məsəl). [Dəli:] "*uşaqları gözləyin, uşaqları gözləyin*" *deyə-deyə epileptik adamlar kimi yerə dəydi, xırıldayaraq yuxuya getdi.* M.İbrahimov. *Əlyarovun üz-gözü əyildi. – Nəyi soruşum, nəyi öyrənim?*

– *deyə xırıldadı.* M.Hüseyn. *Zakir udqundu, özünə yad gələn boğuq, titrək bir səslə xırıldadı.* H.Seyidbəyli.

2. Bax **xışıldamaq**. *Qar xoş bir səda ilə xırıldayır.* B.Bayramov.

**XIRILTI** *is.* Boğulan, yaxud çətin nəfəs alan adamın boğazından çıxan spesifik səs; xır-xır səsi. [Dərviş:] *Qulağımıza xırıltı gəldi.* A.Divanbəyoğlu. [Məstan bəy] *boğazındakı xırıltını rəf etmək üçün iki-üç dəfə öskürdü.* B.Talıblı. *Onun sinəsindən qalxan odlu bağırtılar indi xırıltılara çevrilmişdi.* H.Nəzərli.

**XIRILTILI** *sif.* Xırıltı ilə, boğuq, tutqun, xırıldayan. [Yaşlı kişi:] *Birdən-birə mənə tanış gələn xırıltılı bir səs qışqırmağa başladı.* S.Hüseyn. *Kişi oğlunun üzünə baxıb, xırıltılı səslə güldü.* İ.Şıxlı.

**XIRIM-XIRDA** *is.* 1. Çox işlədilən, tez-tez lazım olan hər cür xırda şeylər, ev şeyləri. *Xırım-xırdanı yeşiyə yığmaq. – Nərgiz, Nərgizcan! – deyə* [Rəşid] *cəld irəli addımlayıb Nərminə xanımın xırım-xırdası ilə yüklü qollarını qızına doğru uzatdı.* Ə.Məmmədxanlı. *Məzlum .. üzünü təmiz qırxdı, xırım-xırda şeylərini və skripkasını yerbəyer edib çamadana yığdı.* S.Vəliyev. *Əsəd kişi .. bu mücrüyə xırım-xırda yığardı və heç kəsin də onunla işi olmazdı.* B.Bayramov.

2. *məc.* Kiçik, xırda, əhəmiyyətsiz, cüzi. *Xırım-xırda işlər. – Oxucularımızdan təvəqqe edirəm inciməsinlər ki, hamam kimi xırım-xırda məsələlər ilə mən onları məşğul edirəm.* "Mol. Nəsr.". *Gərək ki,* [Həsən] *xırım-xırda alver də edirdi.* Qantəmir. [Prokuror:] *Haradasa, kim isə xırım-xırda oğruları, rüşvətxorları həvəsləndirir, şirnikdirir.* M.Hüseyn.

**XIRIP-XIRIP** *is.* Heyvanların otu dişləri ilə qırparkən çıxan səs.

**XIRLAMA** "Xırlamaq"dan *f.is.*

**XIRLAMAQ** *f.* Xır salmaq, başdan-başa bostan eləmək.

**XIRLI**[1] *sif.* Yivli (tüfəng, top, tapança).

**XIRLI**[2] *sif.* 1. *məh.* Varlı, pullu. *Xırlı adam.*

2. Köklü, əsaslı, yerində. *Sözü deyər – xırlı deyər.* (Məsəl).

**XIRLIQ**[1] *is.* Xır salınmış yer, bostan yeri.

**XIRLIQ**[2] *is.* Çınqıllıq, daşlıq. *Xırlıqda ot bitməz.* (Ata. sözü). *Get-gedə güney yerləri sel yuyub xırlığa çevirdi.* S.Rəhimov.

**XIRLI-PIRLI** *zərf dan.* Əməlli-başlı, lazımınca, əsaslı surətdə. [Səfər:] *Döyülməyinə döyüləcəyəm, qoy xırlı-pırlı, ağıllı-başlı döyülüm.* C.Cabbarlı.

**XIRMAN** *is.* [*fars.*] 1. Dəni sünbüldən ayırma əməliyyatı. *..Xəstə olduğum cəhətə bu yay xırmanım hamıdan geriyə qalmışdı.* S.S.Axundov. [Rəşid:] *Qurbanqulu uşağı görər-görməz xırman çəkdiyi atı buraxır və quyunun yanına qaçır.* T.Ş.Simurq.

2. Taxılı döymək, təmizləmək və qurutmaq üçün qabaqcadan hazırlanmış dairəvi düz yer, meydança. *Atlı Hacı Namazalını xırmandan gəlib apardı nəçərnikin yanına.* C.Məmmədquluzadə. *Kəndlilər hamısı böyük bir xırmanın yanına yığılmışdı.* M.İbrahimov. □ **Xırman döymək** – taxılın dənələrini xüsusi alətlərlə sünbüldən ayırmaq. *Danabaş kəndinin kənarında.. Məşədi Ağa kişi on iki yaşlı oğlu Əsəd ilə bahəm xırman döyürlər.* C.Məmmədquluzadə. *Biçər biçini, arpanı, döyər əkinçi xırmanı; Çuval-çuval döyüb yığar əkinçi arpa-buğdanı.* A.Səhhət. [Həsən:] *İskəndər də mənim oğlum olub, xırman döyəndə necə kömək eləyir.* Ə.Haqverdiyev. **Xırman sovurmaq** – taxıl dənələrinə qarışmış samanı ayırmaq üçün onu kürəklə havaya sovurmaq.

◊ **Xırmanüstü vədə** – boş, yalan vədə.

**XIRMANALTI** *is.* Xırman sovrularkən qalan qalıq. *Xırmanaltını bir yerə yığmaq.*

**XIRMANCIQ** *is.* Kiçik xırman.

**XIRMANÇI** *is.* Xırmanda taxıl döyən, xırmanda işləyən adam. *Kənardan baxan xırmançılar buraya yüyürür, "ho-ho-hoş" deyib səs-küy salırdılar.* S.Rəhimov. *İndi sovruq yeli təzəcə qalxdığına görə xırmançılar əl-ayağa düşmüşdülər.* B.Bayramov.

**XIRMANDÖYƏN** bax **xırmançı**.

**XIRMANLIQ** *is.* Xırman salmağa, xırman döyməyə yarar yer. *Xırmanlıq hazırlamaq.*

**XIRNİK** *is.* Subtropik və mülayim iqlimli yerlərdə bitən portağalaoxşar iritumlu, ətli, şirin meyvə (canlı dildə buna yanlış olaraq çox vaxt "xurma"da deyilir).

**XIRP** *təql.* 1. Adətən feillərdən sonra gələrək, onların ifadə etdiyi işin, prosesin birdən, qəfildən, ani olaraq kəsildiyini bildirir. *Faytonçunun səmimi, yanıqlı bir səslə oxuduğu gözəl mahnı birdən xırp kəsildi.* M.Hüseyn. *Kim isə zəncirləri lom ilə yerə atır. Dəzgah xırp dayanır.* M.İbrahimov. *Qədir xırp kiridi. Heç kəs dinmədi.* Mir Cəlal.

2. Tamam, büsbütün, başdan-başa. [Qafar:] *O Püstə arvad xırp yalan deyir.* S.S.Axundov.

**XIRPADAN** *zərf dan.* Birdən, gözlənilmədən; büsbütün. [Qurban Telliyə:] *..Telli, çağa Yazgülün səsini eşidən kimi xırpadan səsini kəsdi.* Ə.Məmmədxanlı.

**XIRPALAMA** "Xırpalamaqdan" *f.is.*

**XIRPALAMAQ** *f.* 1. Boğazından yapışmaq, boğazlamaq. *Mehdi qapını döyüb Əsədi çağırdı. Əsəd tələsik qapını açan kimi Nəbi onu xırpaladı.* "Qaçaq Nəbi".

2. *məc.* Üzmək, əzmək, əzişdirmək, mənəvi əzab və iztirab vermək. *Bu qara düşüncələr onu yorur və pəncəsində əzib xırpalayırdı.* A.Şaiq. *İslam Tellinin izzəti-nəfsini ayağı altına alıb xırpalamışdı.* S.Hüseyn.

**XIRPALANMA** "Xırpalanmaq"dan *f.is.*

**XIRPALANMAQ** *məch.* Mənəvi əzab və iztirab çəkmək. *O, kədərli düşüncələrin ağırlığı altında xırpalanırdı.* – [Qönçə:] *İndi tamam iki aydır hər gecə əzilir, xırpalanıram.* S.Hüseyn.

**XIRSIZ**[1] *is.* Oğru. [Birinci qulam:] *Qanlı xırsızlar! İmdi burdan qaçan uğursuzlar!* H.Cavid. *Qaranlıqda kölgələnmə, gözəl qız! Cilvələnmə xırsızların içində.* M.Müşfiq.

**XIRSIZ**[2] *sif.* Xırı (yivi) olmayan. *Xırsız tüfəng.*

**XIRSIZLIQ** *is.* Oğruluq. *Gördüyünüz bu hərif, xırsızlıqlar yapardı.* M.Rahim.

**XIRT** *təql.* Doğranan, sınan, qopan, parçalanan kövrək şeydən çıxan səs; xırç. *Qolu xırt eləyib yanına düşdü.*

**XIRTAXIRT** *təql.* Bıçaqla, dişlə və s. ilə kəsilən, doğranan bərk şeydən çıxan səs (prosesin davamlılığını göstərir). *Uşaq qəndi xırtaxırt yeyir.* – [Hidayət:] [Əlikram] *adamın başını qatlayıb küt bıçaqla xırtaxırt kəsər, uf da deməz.* B.Bayramov.

**XIRT-XIRT** b a x **xırtaxırt**. [Kərim baba:] *Qoyunların xırt-xırt otlamasından gözlərimin qapaqları ağırlaşmışdı.* A.Şaiq. [Nadir] *utandığından qızarıb başını aşağı dikdi və atların xırt-xırtla* (z.) *arpa çeynəmələrinə tamaşa etməyə başladı.* B.Talıblı.

**XIRTILDAMA** "Xırtıldamaq"dan *f.is.*

**XIRTILDAMAQ** *f.* Xırt-xırt səsi çıxartmaq. *Quşbaşı qarların ağır-ağır yerə enməsi, ayaqların altında xırtıldaması adama ayrı ləzzət verir.* M.Rzaquluzadə.

**XIRTILDATMA** "Xırtıldatmaq"dan *f.is.*

**XIRTILDATMAQ** *f.* Dişlərilə sındıraraq, doğrayaraq, əzərək yemək, xırtıldada-xırtıldada yemək (bərk, kövrək şeyi). *Qazmağı, qəndi xırtıldatmaq. – Soldat da bizim kökü xırtıldatmağımızı eşidib dedi..* S.Vəliyev.

**XIRTILTI** *is.* Sınan, qəlpələnən şeydən çıxan səs.

**XIS-XIS** b a x **xısın-xısın**. *Bir də gördülər ki, adamlar xıs-xıs danışırlar. Nəbi ev yiyəsindən soruşdu..* "Qaçaq Nəbi".

**XISILDAMA** "Xısıldamaq"dan *f.is.*

**XISILDAMAQ** *f.* Pıçıltı ilə, çox yavaş səslə, altdan-altdan demək, söyləmək. *Dağbaşev Sübhanverdizadənin bu hərəkətindən qorxuya düşdü və onu qucaqlayan kimi: – Kimin? – deyə xısıldadı.* S.Rəhimov. *Məmməd, yumru alnının altından ifadəsi və hərəkəti güclə seçilən bozaraq gözlərini arada bir ətrafına dolandırıb .. xısıldadı.* Ə.Əbülhəsən.

**XISILTI** *is.* Çox yavaş, gizli danışıq səsi, pıçıltı. *Kosa katibin qulağına əyilərək xısıltı ilə: – Öz aramızda, bir iş var, – dedi.* S.Rəhimov. [Fərman bəy] *bir an dinməyib ətrafı diqqətlə yoxlayandan sonra xısıltı ilə danışmağa başladı.* M.Hüseyn. *Elə bu vaxt Maral lap yanında bir xısıltı eşitdi.* Ə.Əbülhəsən.

**XISIN-XISIN** *zərf* Yavaş-yavaş, gizli-gizli, xəlvəti, altdan-altdan. *Səttarın anası hələ xısın-xısın ağlayırdı.* P.Makulu. *Orada-burada, xısın-xısın danışıb-gülüşən tək-tək adamlar görünürdü.* M.Süleymanov.

**XISINLAŞMA** "Xısınlaşmaq"dan *f.is.*

**XISINLAŞMAQ** *qarş.* Bir-birilə gizli, pıçıltı ilə danışmaq, xısın-xısın danışmaq, pıçıldaşmaq, xəlvəti danışmaq. *Molla Qafar, Kərbəlayı Hətəmxan, bir də Hacı Səfiqulu kürklərinə birə düşmüş kimi yaman xısınlaşırlar.*

S.Rəhimov. [İsmayıl kişinin dəstəsi] *yollar üstündəki kəndlərdə dayanıb, tanış-bilişlə görüşür, onlarla xısınlaşır, öz məqsədlərini onlara izah edir, .. üsyan etməyə çalışırdılar.* P.Makulu.

**XIŞ** *is.* Yer şumlamaq üçün ibtidai kənd təsərrüfatı aləti. [Tarverdi] *..xışları, boyunduruqları, cüt qayışlarını yoxlayır, əlavə xış düzəldir, yerə salmaq istəyirdi.* S.Rəhimov. *..Dağın lap ətəyində kəndli xışla yer şumlayırdı.* B.Bayramov.

**XIŞ-XIŞ** *təql.* Xışıltı səsi. *Zərf mənasında.* Xışıltı ilə. *Yarpaqlar küçələr boyunca sürünüb gedən boz boğanaq içində xış-xış xışıldayır.* Mir Cəlal. *..Yaşıl atlazdan don geyinmiş zəmilər xış-xış xışıldayaraq dalğalanırdı.* S.Şamilov.

**XIŞILDAMA** "Xışıldamaq"dan *f.is.*

**XIŞILDAMAQ** *f.* Xışıltı səsi çıxartmaq, xış-xış eləmək. *Yay yağışlarından sonra yolların kənarında bitmiş uzun, yaşıl otlar külək əsdikcə dalğalanır və xışıldayırdı.* M.Hüseyn. *Dənizdən xəfif meh əsir, yarpaqlar xışıldayır, şəhər yatırdı.* M.Süleymanov.

**XIŞILDATMA** "Xışıldatmaq"dan *f.is.*

**XIŞILDATMAQ** *f.* "Xış-xış" səs çıxartmaq. *Arabir xəfif külək əsir, xəzan yarpaqlarını xışıldadırdı.* M.Hüseyn. *Yaşıl ağaclarda saralan yarpaqların sayı günü-gündən artır, yerə tökülür və ara-sıra əsən yel də bu yarpaqları xışıldada-xışıldada süpürür və küncə-bucağa toplayırdı.* T.Ş.Simurq.

**XIŞILTI** *is.* 1. Bir-birinə dəyən, sürtünən şax şeydən və ya axan sudan çıxan xəfif səs, xış-xış səsi. *Atlaz xalatların xışıltısı. – Ay qara buludun dalına girdi, yerə qara pərdə çəkildi. Ocağın alovu söndü, meşədə xışıltı artdı.* A.Divanbəyoğlu. *Xışıltı ilə axan çayın səsi ətrafın sükutuna başqa bir ahəng verirdi.* T.Ş.Simurq. *Söyüdlü arx yarpaqların incə xışıltısı altında səssizcə axıb gedirdi.* İ.Əfəndiyev.

2. Təngnəfəslikdən törəyən boğuq səs; töyşük. [Sədrin] *sinəsindəki xışıltı get-gedə artırdı.* B.Bayramov.

**XIŞILTILI** *sif.* Xışıltı səsi çıxaran, törədən. *Xışıltılı bir yağış meşəyə səpələnməyə .. göylərdə şimşəklə oynamağa başladı.* S.Rəhimov.

**XIŞIRTI** b a x **xışıltı**.

**XIŞLAMA** "Xışlamaq"dan *f.is.*

**XIŞLAMAQ** *f.* Torpağı (yeri) xışla sürmək, şumlamaq. *Halbuki Cavahir ev işindən başqa, yəni mal-qaranı görmək, təzək qoymaq, xörək hazırlamaq, çörək yapmaqdan başqa, bağçanı suvarır, yer xışlayır, əkib-biçir, bir sözlə, hər bir işi görürdü.* T.Ş.Simurq.

**XIŞLANMA** "Xışlanmaq"dan *f.is.*

**XIŞLANMAQ** *məch.* Xışla sürülmək, şumlanmaq. *Sahə başdan-başa xışlanmışdır.*

**XIŞLANMIŞ** *f.sif.* Xışla sürülmüş, şumlanmış.

**XIŞMA** *is.* Adətən "bir" sözü ilə: **bir xışma** – ovucdolusu, bir ovuc. *Bir xışma ot. Bir xışma buğda. – Qaşıq gəlincəyə qədər səbr etməyib* [Ağasəfər] *aşdan bir xışma götürdü.* Ə.Əbülhəsən. *Salam, atından enib qara torpaqdan bir xışma götürdü, baxdı.* Mir Cəlal. [Yusif] *deməyə söz tapmayıb naxırçı çantasından bir xışma zoğal çıxartdı: – Aç ətəyini, Şahpəri!* B.Bayramov.

**XIŞMALAMA** "Xışmalamaq"dan *f.is.*

**XIŞMALAMAQ** *f.* 1. Qamarlayıb götürmək, ovcu ilə götürmək, ovuclamaq. *Əlyarov pulları cəld xışmalayıb stolunun orta siyirməsinə qoydu.* M.Hüseyn. *Kəndlilər toxumluq buğdanı xışmalayıb dəmyə yerlərə səpəndə şirin bir arzu ilə "ya bəxt" deyərlər.* Mir Cəlal. *Nərgiz yeni-yeni ələ gələn saçını xışmaladı, gözləri torpağa baxa-baxa qaldı.* B.Bayramov.

2. Ovuclayıb əzik-əzik etmək, büzüşdürmək, əzib-tökmək. *Hacı Rəsul, müştərisindən daha ağır söz eşitməmək üçün əlindəki qəzeti xışmalayıb ovcunda sıxdı.* Mir Cəlal. *Firəngiz cibindəki kağızları xışmaladı.* B.Bayramov.

**XIZIR** *is.* 1. İlyas peyğəmbərin adı.

2. *məc.* Xilaskar.

**XİDMƏT** *is.* [*ər.*] 1. Bir idarədə, müəssisədə və s.-də maaşla qulluq etmə, işləmə, rəsmi vəzifə yerinə yetirmə. ☐ **Xidmət etmək** – bir idarədə, müəssisədə və s.-də maaşla işləmək, qulluq etmək, rəsmi vəzifə

yerinə yetirmək. *Qorodovoy Kərbəlayı Zal iyirmi beş ildən artıq polis idarəsində xidmət edirdi.* Ə.Haqverdiyev. // Vəzifə, iş. *Zeynal ötəyə-bəriyə müraciət edib sabiq xidmətini geri istəyirdisə də, müvəffəq olmayırdı.* S.Hüseyn. *Xalça fabrikində girib xidmətə; Bağlandı zəhmətə vicdanla Rəna.* M.Rahim.

2. Hərbi vəzifə yerinə yetirmə, ordu sıralarında və ya donanmada qulluq etmə; əsgəri vəzifə. *Orduda xidmət. Həqiqi hərbi xidmətə çağırış. – Bu qürbət şəhərdə hərbi xidmətdə olan bir neçə yoldaşla bərabər əlahiddə bir evdə yaşayırdıq, evdə su lüləsi yoxdu, qonşu evdən aldığımız quyu suyunu qaynadıb içirdik.* Ə.Məmmədxanlı.

3. Orduda hərbi məşğələlər, vəzifələr sahəsi, habelə onlara xidmət edən idarələr sistemi. *Ordunun tibbi xidmət idarələri. İnzibati xidmət. Kəşfiyyat xidməti.*

4. İstehsalat sahəsi, habelə bir işin xüsusi sahəsinə baxan idarə, təşkilat. *Hava xidməti. Qəza-bərpa xidməti. Dəmir yolunun hərəkət xidməti.* // Adamların ehtiyaclarını, rahatlığını təmin edən təsərrüfat və ya başqa vasitələr sistemi. *Kommunal xidməti. Rabitə xidməti.*

5. Yüksək qiymətə, ada, nüfuza layiq olan hərəkət, fəaliyyət, iş. *Vətən qarşısında böyük xidmət. Yubilyarın xidmətləri haqqında danışmaq. – Sənin işin, xidmətin, bir qəhrəmanlıq kimi tarixdə qalacaqdır.* R.Rza. [Rəşid:] *..Mən bizim xidmətimiz və mövqeyimiz arasındakı fərqi başa düşürdüm.* İ.Hüseynov. ☐ **Xidmət etmək (eləmək)** – birinin və ya bir şeyin xeyri, səadəti, xoşbəxtliyi, rifahı naminə iş görmək, çalışmaq, əmək sərf etmək. **Xidmət göstərmək** – bax **xidmət etmək**. *Mərhum Həsən bəy* [Zərdabi] *ömrünün əvvəlindən axırınadək .. millət yolunda xidmət göstərməklə camaat içində çox şöhrət qazanmışdı.* "Mol. Nəsr.".

6. Birinə qulluq göstərmə; birinin ehtiyac və tələbatını təmin etmək üçün görülən iş. *Dostcasına xidmət. Öz xidmətini təklif etmək. Əvəzsiz xidmət. Əhaliyə mədəni-maarif xidməti. – Mən labüd qaldım bunlara* [hamballara] *deyim ki, bir surətdə ki, bunlar bizə qulaq asmırlar, bizə bunların xidməti heç lazım deyil.* C.Məmmədquluzadə. [Fəxrəddin:] *Gözəl Səba! – dedi, – sən məni bu xidmətinlə minnətdar edirsən.* M.S.Ordubadi. *Kosa bu xidmətin qabağında özünü ömürlük kuryerlik vəzifəsindən azad olmuş sayırdı.* S.Rəhimov. ☐ **Xidmət etmək (göstərmək)** – başqalarının hər hansı bir ehtiyac və tələbatını təmin edəcək iş görmək. *Alıcılara yaxşı xidmət etmək. – Əmin qəsrində xəlifə tərəfindən təyin edilən qızıl kəmərli qulamlar, zümrüd və yaqut xalxallı cariyələr və zərinələrə bürünmüş kənizlər Azərbaycan heyətinə xidmət edirdi.* M.S.Ordubadi. *Tarix göstərir ki, öz zamanında tərəqqiyə xidmət edən əsərlərin ömrü daha uzun olur.* M.Hüseyn. *Rəşidin atası neft mütəxəssisi olmaq, xalqına kömək, Vətəninə xidmət etmək istəyirdi.* Ə.Vəliyev.

**XİDMƏTÇİ** *is.* 1. Zehni və ya istehsalatla bağlı olmayan fiziki əməyin müxtəlif sahələrində maaşla xidmət edən adam; qulluqçu. *Fəhlə və xidmətçilər. – Mirzəağa* [Cəmiləni] *istirahət evinin bir xidmətçisi və ya məsul bir işçisi zənn etdi.* S.Hüseyn. *Kənd məktəbinin qoca xidmətçisi İmran kişi artırmaya qalxıb qapını döydü.* Q.İlkin. // Adamların ehtiyaclarını təmin etməklə məşğul olan, xidmət göstərən şəxs. *Xidmətçi qızlar hər sərnişinə ayrıca balaca podnosda və çox təmiz qab-qacaqda yemək paylayırlar.* M.İbrahimov.

2. Ev qulluqçusu (qız, qadın). *Məhəmməd Səfi ağa bir az səbir eləyib, xidmətçi qızı* [Alının] *dalınca göndərdi.* Çəmənzəminli. [Ceyran] *Eldarın evindəki xidmətçi qadından da bəzi məlumat alır.* S.Hüseyn. // Qulluqçu, nökər. *Axırda* [Cəlilin] *nadincliyindən anası da bezar olub, onu bir dükançı yanına xidmətçi qoydu.* İ.Musabəyov. [Pəri Bəhrama:] *Onu yaxşı bil ki, sən bu evdə xidmətçi kimi bir şeysən.* C.Cabbarlı. *Əmioğlunun xidmətçisi Məmmədrza uşaqlıqdan bu üç ailə içində yaşadığına görə, hamımız ona bir külfət üzvü kimi baxırdıq.* S.S.Axundov.

**XİDMƏTÇİLİK** *is.* Maaşla bir idarədə və ya bir yerdə xidmət etmə, işləmə; xidmətçinin gördüyü iş.

**XİDMƏTİ** *sif.* Xidmətlə, rəsmi vəzifə ilə, işlə bağlı olan. *Xidməti işlər. Xidməti ezamiyyət. Xidməti maşın.*

**XİDMƏTKAR** *is.* [*ər.* xidmət və *fars.* ...kar] Xidmətçi. *Sübh çox ertə oyanardı qarı; Durğuzar idi hamı xidmətkarı.* A.Səhhət. *Nə keşikçilərdən, nə qapıçılardan, nə də sair xidmətkarlardan əsər-əlamət yox idi.* M.Rzaquluzadə.

**XİDMƏTKARLIQ** *is.* Xidmətçilik, birinin xidmətində olma. // *məc.* Qulluq göstərmə, xidmət göstərmə; nökərçilik.

**XİDMƏTSEVƏN** *sif.* 1. Yaxşı baxılmağı, yaxşı qulluq edilməyi, yaxşı xidmət edilməyi tələb edən. *Çay çox xidmətsevən bitkidir.*

2. *məc.* Öz işinə, vəzifəsinə həddən artıq can yandıran, lakin ona çox rəsmi yanaşan adam.

**XİFFƏT** *is.* [*ər.*] Fikir, dərd, qəm, qüssə; fikir çəkmə. *Qaldı mən dilxəstəyə ancaq məlalü xiffətin.* S.Ə.Şirvani. *Bəsdir mənə verdiyin bu xiffət.* Natəvan. [İbrahim:] *Gövhərtac .. xiffətdən, qüssədən müqəvvaya dönübdür.* Ə.Haqverdiyev. ◻ **Xiffət çəkmək** – 1) fikir çəkmək, kədərlənmək, qüssələnmək, qəm-qüssə etmək. *Dolanım başına, mürüvvət deyil; Bu qədər ki, sənsiz xiffət çəkirəm.* Q.Zakir. [İnsan] *hər gün görsə də, qəlbinin duymadığı, nəfəsinin ətrini hiss etmədiyi bir adam ondan uzaqlaşandan sonra, qəlbindəki boşluğu görür və gecə-gündüz xiffət çəkir.* İ.Şıxlı; 2) başqasının fikrini, qayğısını çəkmək. *Əzəlindən oldum eşqə dəlalət; Sirr verdim namərdə, etdi ədavət; Yolunda çəkməkdən xiffət, xəcalət; Əriyib bu Cümə çağaya döndü.* Molla Cümə. *Əzizim, meşə mənsiz; Dağ mənsiz, meşə mənsiz; Qorxuram xiffət çəkə; Yar dərdə düşə mənsiz.* (Bayatı). ◻ **Xiffət eləmək (etmək)** – b a x **xiffət çəkmək** 1-ci mənada. [Ata:] *Ay bala, niyə xiffət eləyirsən, özün bilirsən ki, biz kasıbıq, qohum-əqrəbamız və möhkəm arxamız yox, bizə qızmı verərlər?* Ə.Haqverdiyev. *Qardaş-bacı .. dağlar qədər dərdi olan analarını xiffət etməyə qoymurlar.* S.S.Axundov. *Gənc ömrümün bağında yazım sənsən, gülüm sən; Xiffət edib, sıxılıb, qüssələnmə, gülüm, sən.* N.Xəzri. **Xiffət gətirmək** – kədər-qüssə gətirmək, kədərləndirmək, kədərə-qüssəyə səbəb olmaq. *Evlərin təhər-tövründə qəlbə xiffət gətirən bir köhnəlik vardı.* Ə.Əbülhəsən. **Xiffət vermək** – fikir çəkməsinə, dərdlənməsinə, kədərlənməsinə səbəb olmaq, dərdə salmaq, xiffətləndirmək.

**XİFFƏTLƏNDİRMƏ** "Xiffətləndirmək"-dən *f.is.*

**XİFFƏTLƏNDİRMƏK** *f.* Xiffət çəkdirmək, kədərləndirmək, qəm-qüssə çəkdirmək.

**XİFFƏTLƏNMƏ** "Xiffətlənmək"dən *f.is.*

**XİFFƏTLƏNMƏK** *f.* Xiffət çəkmək, kədərlənmək, qüssələnmək. *Oğlunun dərdindən ana çox xiffətləndi.*

**Xİ-Xİ-Xİ!** *nida.* Yavaş gülüş bildirən səs təqlidi. [Allahyar:] *Ə, Tarverdi, yaz. – Onun savadı var ki, yaza! Xi-xi-xi.* S.Rəhimov. *Uşaqlar "xi, xi, xi" edib açılışmağa başladılar.* M.İbrahimov.

**XİLAF** *is.* [*ər.*] 1. Zidd, əks. [Hakimi-şər:] *Ağa Salman, deyirlər, Hacı Qafurun övladı qalıbdır. Sənin bu sözün xilafına isbatın varmı?* M.F.Axundzadə. *Usta Ramazan adətin xilafına səbirsizlik göstərdi.* M.Hüseyn.

2. Yalan, qeyri-həqiqət. [Vəzir:] *Sənin çörəyin mənə qənim olsun, əyər xilaf ərz edirəm.* M.F.Axundzadə. [Əmir:] *Zeyd, mənim sözüm əmir sözüdür; onda xilaf ola bilməz. Leylanı sənə verərəm. Lakin sən mənə qırx gün möhlət ver.* Ü.Hacıbəyov.

◊ **Vədi xilaf olmaq** – bu və ya başqa səbəbə görə vədini, dediyini yerinə yetirə bilməmək. [Molla İbrahim Xəlil:] *Yerdə qalır iyirmi pud, onu da yəhudilər aparsınlar ki, mənim vədim xilaf olmasın.* M.F.Axundzadə. **Vədinə xilaf çıxmaq** – verdiyi sözü, vədi yerinə yetirməmək, yalançı çıxmaq. [Əbülhəsənbəy:] *Hərgah vacib işim olmasaydı, heç vaxt mən verdiyim vədəmə xilaf çıxmazdım.* M.S.Ordubadi. *Lətifə yenə gözlərini qaldırmadan cavab verdi: – Bəli, usta. Qoy vədinə xilaf çıxan utansın!* M.Hüseyn.

**XİLAFƏT** *is.* [*ər.*] *tar.* Ərəb xəlifələrinin hakimiyyət dövrü; xəlifəlik. // Ərəb istilaları nəticəsində yaranmış, başında xəlifənin durduğu feodal dövlət.

**XİLAS** *is.* [*ər.*] Qurtulma, xilas olma; nicat, qurtuluş. ◻ **Xilas etmək** – 1) qurtarmaq, nicat vermək. *Təhlükədən xilas etmək. Suda boğulanları xilas etmək. – Cəfayə, zülmə bütün nifrət eyləyir aləm; Xilas elə bəşəri*

*zülmdən cəsarət ilə.* Ə.Vahid. *Yoldaşlarından bir neçəsi onu xilas etməyə yüyürmək istədisə də, nəzarətçi ağacını qaldırıb onlara çığırdı.* M.Rzaquluzadə; 2) azadlığa çıxartmaq, azadlıq vermək. **Xilas olmaq** – qurtulmaq, azad olmaq, nicat tapmaq, canını qurtarmaq. *Ölümdən xilas olmaq. Əsarətdən xilas olmaq. – Veylabadın üstə səadət günü doğdu. Şəhər bir böyük bəladan xilas olmuşdur.* Çəmənzəminli. [Veysəl] *tələdən nə cür xilas olmaq haqqında düşünərkən, qaranlıqdan kimsə soruşdu.* Ə.Vəliyev.

**XİLASEDİCİ** *sif.* Xilas etmək üçün olan, xilas edən; xilaskar, qurtarıcı. *Xilasedici kəmər. Xilasedici qayıq.*

**XİLASETMƏ** b a x **xilasedici**. *Xilasetmə ekspedisiyası. Xilasetmə stansiyası.*

**XİLASKAR** *sif.* [*ər.* xilas və *fars.* ...kar] Təhlükədən, ölümdən xilas edən; xilasedici, qurtarıcı. // İs. mənasında. *Rüxsarə axırıncı olaraq öz xilaskarını ziyarət etməli, onunla vidalaşmalı idi.* S.Rəhimov. *Olmazın sarsıntı keçirmiş Mehriban xilaskarının boynuna sarılıb uşaq kimi ağlayır.* H.Seyidbəyli.

**XİLASKARLIQ** *is.* Təhlükədən, ölümdən xilas etmə, qurtarma, xilas olmasına, qurtarmasına kömək etmə.

**XİLQƏT** *is.* [*ər.*] 1. Yaradılma, yaradılış. *Dünyayə gələn getmək üçündür, bu nə qəmdir; Bir fikr elə, bu xilqəti-aləm nə üçündür.* S.Ə.Şirvani. *Xoşdur xilqətdəki hər gözəlliyi; Ürəkdən duyaraq anlaya bilmək!* M.Müşfiq. *Minlərcə gözəl olsa da hər millət içində; Olmaz sənə bənzər, gözəlim, xilqət içində.* Ə.Vahid.

2. Birinin təbiətində, yaradılışında olan hal, xüsusiyyət; təbiət, yaradılış. *Bu xasiyyət onun xilqətində var. Bu adamın xilqəti belədir. – ..Ürək də qəribə xilqətdir deyən; Bəzən öz istəyi özünə yükdür.* M.Araz.

**XİLLƏ** *is.* Bəzi məməli heyvanların (fil, qaban və s.-nin) ağzının kənarındakı iri, möhkəm dişlər.

**XİMER** *is.* [*yun.*] Əjdahaya bənzəyən, ağzıalovlu heyvan.

**XİMƏ** *is.* [*ər.*] Çadır, alaçıq.

**XİNGAL** *is.* Dama-dama kəsilmiş xəmir parçalarından bişirilən xörək. *Sulu xingal. Quru xingal. Qovurma xingal. – Fərrux xingalın hazır olub-olmamağını yoxlamaq üçün o biri otağa keçəndə Molla Qurban durub toqqasını genəltdi.* Ə.Vəliyev.

◊ **Xingal kimi doğramaq** – tikə-tikə doğramaq, tikə-tikə etmək. *..Bizi görən kimi yükləri töküb qaçacaqlar, qaçmasalar, əl açsalar, hamısını xingal kimi doğrayacağam.* M.F.Axundzadə. *Mənə Bahadıroğlu Xanbaba deyərlər, qoymaram ayağıvuzi ayağıvuzun üstündən götürəsiz, hamıvuzi xingal kimi doğraram.* H.Sarabski.

**XİNGALXANA** *is.* Xingal bişirilib satılan yeməkxana.

**XİNGALLIQ** *sif.* Xingal üçün hazırlanan, xingala yarar. *Xingallıq qoyun əti.*

**XİNİN** b a x **kinə**. *İsitmə* (*malyariya*) *müalicəsində qiymətli dərman olan kinə* (*xinin*), *Cənubi Amerikanın yerli əhalisi olan inklər tərəfindən tapılmışdır.* M.Əfəndiyev. *Qız yol çantasından kiçik bir qutu, qutunun da içindən sterilizə olunmuş pambıq arasındakı iynəni çıxardıb, Heybətin kürəyinə xinin vurdu.* M.Hüseyn.

**XİRƏLƏMƏK** *f.* Bulandırmaq.

**XİRİD** *is.* [*fars.*] Satınalma, alma (mal, şey). □ **Xirid eləmək (etmək)** – 1) satın almaq, pulla almaq (mal, şey və s.). [Əsgər bəy:] *Təbrizdə sən bizə də, özünə də xirid elə.* M.F.Axundzadə. [Ağa Qurban:] *Keçən il getmişdim Nijni yarmarkasına, mal xirid eləyib yola saldıqdan sonra bir neçə gün istirahət üçün qalmaq xəyalına düşdüm.* Ə.Haqverdiyev; 2) *dan.* satıb başdan eləmək.

**XİRİDAR** *is.* [*fars.*] 1. Alıcı, müştəri. *Malın xiridarı yoxdur. – Mətaın atma bazarə; Xiridar olmayan yerdə.* M.V.Vidadi. *Qədrikəmali-hüsnü bilir aşiqi-həzin; Əlbəttə, qədri-zərri xiridar olan bilir.* S.Ə.Şirvani. // Məc. mənada. [Zakir] *hüsnünə xiridar olandan bəri; Saf cana yetişib ziyan əlindən.* Q.Zakir.

2. *məc.* Bir şeyin qiymətini bilən, ona lazımi qiymət verə bilən, başa düşən; sərraf. *Söz xiridarı. – Hicrana yandı canım, tüstüsüdür dağdakı çən; Canımı hərraca qoydum, de, xiridarı hanı?* Şəhriyar. *İsi dayının "tərzi-ifadəsi" Məmmədsadığın olduqca xoşuna gəldi. O belə "tərzi-ifadə"nin xiridarı idi. Lakin İsi dayının "tərzi*

*ifadəsi*"*ni çətin anladı.* "*Məkruf*" *sözünü o bilirdi.* B.Bayramov.

**XİRQƏ** *is.* [*ər.*] *köhn.* 1. Cübbənin altından geyilən içi pambıqlı qısa geyim. *Əfğan çəkib etdi xirqəsin çak; Səhralərə düşdü zarü qəmnak.* Füzuli. [Şah:] *Bir yandan da ədavətin kəsrətindən xirqəmin altında bıçaq tutub bu xalıları doğrayırdım.* Ə.Haqverdiyev. *..Vaqif isti kürkünü soyundu, nökərlərdən biri onun çiyninə zoğalı çuxasının üstündən samur xəzli ipək xirqə saldı, sonra içəri girdi.* Çəmənzəminli.

2. Dərvişlərin geydikləri uzun üst paltar. *Qurbani qurbandı şahın dərinə; Dərviş bilmir xirqə nədi, dəri nə?* "Qurbani".

**XİRTDƏK** *is.* Nəfəs yolunun yuxarı hissəsi. *Əlyarov az qala Teymurun xirtdəyindən tutub boğmaq istəyirdi.* M.Hüseyn. [Yusif] *sümüyü çıxmış yanağını, xirtdəyini, cəhəngini qanatmışdı.* B.Bayramov.

◊ **...Xirtdəyə kimi çıxmaq** – lap çox olmaq, həddini aşmaq; boğaza çıxmaq. *Qazma planı axsayır, yeni neft yatağı açılır, hər addımda israf xərclər xirtdəyə çıxırdı.* M.Süleymanov. [Hətəmov:] *İş-gücün xirtdəyə çıxan vaxtı başlamısınız ki, biz səyahətnamə oxumağa gəlmişik.* B.Bayramov. **Xirtdəyə qədər (kimi)** – 1) boğaza qədər. *Cavad yoldaşları ilə birlikdə xirtdəyə kimi lehməyə bataraq, qalın meşələrdən keçir, həmişə məqsədə, hədəfə doğru irəliləyir.* Ə.Vəliyev. *Nəhayət, divar qəzetində buraxılan karikaturada Mirzənin xirtdəyə qədər çaxır çəlləyinə girdiyi göstərilirdi.* Mir Cəlal; 2) lap çox, həddindən çox. **Xirtdəyi əl(in)də olmaq** – taleyi ... əlində olmaq, tamamilə asılı olmaq. [İskəndər kişi:] *Ondan sonra* [yasavulun] *xirtdəyi bizim əlimizdədir.* M.Hüseyn. **Xirtdəyi ələ keçmək** – yaxalanmaq, girə keçmək, ələ keçmək. **Xirtdəyindən yapışmaq** – sıxışdırmaq, çıxılmaz vəziyyətə salmaq, boğazından yapışmaq.

**XİRTDƏKLƏMƏ** "Xirtdəkləmək"dən *f.is.*

**XİRTDƏKLƏMƏK** *f.* Xirtdəyindən tutmaq (yapışmaq), yaxalamaq, boğazlamaq. [Qəssab] *oğlan içəri girən kimi, onu xirtdəkləyib basdı yerə.* (Nağıl). *Səmənnaz qarı qapını açanda atlılardan biri qəfildən onu xirtdəklədi.* Ə.Vəliyev. *Daldan iki qüvvətli əl* [polkovniki] *xirtdəklədi.* S.Vəliyev.

**XİRTDƏKLƏŞMƏ** "Xirtdəkləşmək"dən *f.is.*

**XİRTDƏKLƏŞMƏK** *qarş.* Bir-birinin xirtdəyindən (boğazından) yapışaraq, dalaşmaq, boğazlaşmaq.

**XİSLƏT** *is.* [*ər.*] İnsanın təbiətinə məxsus sifət; xasiyyət, təbiət. *Xoş xislət. Sərt xislət.* – [Şirin Çingizə:] *Əşirət dövründə bir ailə başçısının şəxsi xisləti yekə bir nəslə keçmiş və indiyə qədər də davam edir.* Çəmənzəminli. *Əvət, qəribədir xislətim mənim; Dinlə, uzunsa da söhbətim mənim.* M.Müşfiq.

**XİTAB** [*ər.*] 1. Bir şəxsə və ya camaata müraciətlə deyilən sözlər; müraciət. *Məcnun ki, eşitdi bu xitabı; Verdi bu əda ilə cavabı.* Füzuli. *İlimizin hər günü, yaxşı bilirəm ki, mən; Ağsaçlı atalardan xitabdır nəsillərə.* S.Rüstəm. *Şüşənin altında naşı, lakin həyəcanlı bir xətlə mənə xitab yazılan bir kağız görürəm..* Mir Cəlal. ◻ **Xitab etmək (eləmək)** – müraciət etmək, üzünü tutaraq söz demək. [Şah] *sonra üzün hərəmlərə tutub xitab elədi: Mənim əziz həmfiraşlarım! Mən kəmali-əfsus ilə məcburəm ki, bir yaman xəbər sizə elan edəm.* M.F.Axundzadə. *Zeynal çox mütəəssir idi. Mehribanın xoş bir şivə ilə ona xitab etməsi həyəcanını artırdı.* S.Hüseyn.

2. *qram.* Cümlədə kimə işarə edildiyini bildirən, lakin qrammatik cəhətdən cümlə üzvü olmayan söz və ya söz qrupu. *Xitabdan sonra nida işarəsi qoymaq.*

**XİTABƏN** *zərf* [*ər.*] Xitab edərək, üzünü tutaraq, xitabla, müraciətlə. [Müslümbəy] *qoca kişiyə xitabən: – Əmi, bu uşaq sənin nəyindir, oğlundurmu? – deyə sual etdi.* A.Səhhət. *Namiq Kamalın bu şerini Mirzə Süleyman bəy .. beş-on kişi bir yerdə görən kimi, onlara xitabən deklomasiya üsulu ilə söyləyirdi.* B.Talıblı.

**XİTABƏT** *is.* [*ər.*] 1. Xətiblik.

2. Səlis və aydın nitq söyləmə qabiliyyəti. *Ey süxəndanan, bu günlər bir hidayət vəqtidir! Ülfətü ünsiyyətə dair xitabət vəqtidir!* M.Ə.Sabir. ◻ **Xitabət kürsüsü** – natiq üçün düzəldilmiş xüsusi hündür yer.

*Qurban ağır-ağır ayağa durub xitabət kürsüsünə yaxınlaşdı.* İ.Şıxlı. *Bir stəkan təmiz su; Bir xitabət kürsüsü; Ürəyimin gur səsi; Dalğa-dalğa yayılsın; Yer də, göy də ayılsın!* X.Rza.

**XİTABNAMƏ** *is.* [*ər.* xitab və *fars.* ...namə] bax **müraciətnamə**. *Arabir divarlara xitabnamələr yapışdırılır: Ukrayna hökuməti kəndliləri bolşeviklərlə mübarizəyə dəvət edir.* Çəmənzəminli.

**XİTAM** *is.* [*ər.*] Bitmə, qurtarma, sona çatma; axır, son, tamam. □ **Xitam vermək** – 1) bitirmək, tamamlamaq, başa vurmaq. *Xanəndə yastı balabanla oxuyub gecəyə xitam verərdi.* H.Sarabski. *Ərşad* [Əflatun və Ərəstunun] *mübahisəsinə xitam verib birlikdə layihəni hazırladı.* S.Rəhimov; 2) *hüq.* işi bağlamaq, qurtarmaq, xətm etmək.

**XİYABAN** *is.* [*fars.*] Hər iki tərəfində ağac əkilmiş yer, yol və s. *Bağ gözəl bağdır: bir böyük xiyabanı var ki, iki tərəfindən uca çinarlar qalxıb.* Ə.Haqverdiyev. *Qar hər yeri bürüyən zaman,* [uşaqlar] *bağın xiyabanlarında qardan top qayırar, onları yumalamağa başlardılar.* S.S.Axundov. *Bulvarın xiyabanlarında salxım-salxım parlaq işıqlar yandı.* H.Seyidbəyli.

**XİYABANLI** *sif.* Xiyabanı olan, hər iki tərəfi ağaclı. *Xiyabanlı park.*

**XİYABANLIQ** *is.* Xiyaban olan yer; xiyaban. *Şəhərin üst tərəfi xiyabanlıq idi.*

**XİYAR** *is.* Qabaq fəsiləsindən olan uzunsov, yaşıl, tumlu bostan meyvəsi. *Yayda süfrədə xiyar görünməsə, hamını kədər basar.* Ə.Vəliyev. *Dağ ətəyində pomidor hələ indi-indi qızarır, tər xiyar nübarını verirdi.* B.Bayramov.

**XİYARƏK** *is. tib.* Qasıqda limfa vəzilərinin iltihabından törəyən xəstəlik.

**XİYARLIQ** *is.* Xiyar əkilmiş yer, xiyar bostanı.

**XİZƏK** *is.* Təkər əvəzinə altı sürüşkən qoşa ağac və ya dəmir üzərində qurulmuş qış arabası. [Rus Əhmədin] *donan sulardan, buzun üstü ilə arabaların keçməsindən və adamların keçə çəkmə geyib at qoşulmuş xizəklə gəzməsindən olan söhbətlər uşaqlara daha çox xoş gəlirdi.* İ.Şıxlı. *Uşaqlar da qar yağanda; İşə saldı xizəkləri.* M.Dilbazi. □ **Ayaq xizəyi** – qar üzərində hərəkət etmək üçün ayaqlara bənd edilən altı sürüşkən yastı ağac parçaları.

**XİZƏKÇİ** *is.* Xizək sürən, xizək idmançısı.

**XLOR** *is.* [*yun.* chloros – yaşımtıl-sarı] Texnikada, sanitariyada – zərərsizləşdirici, hərbi işlərdə isə zəhərləyici maddə kimi işlədilən yaşımtıl-sarı rəngli boğucu kimyəvi maddə – qaz.

**XLORÁTOR** [*yun.*] Suyu xlorlaşdırmaq üçün cihaz.

**XLORLAMA** "Xlorlamaq"dan *f.is.*

**XLORLAMAQ** *f.* Xlor vasitəsilə təmizləmək. *Suyu xlorlamaq.*

**XLORLANMA** "Xlorlanmaq"dan *f.is.*

**XLORLANMAQ** *məc.* Xlor vasitəsilə təmizlənmək. *Suyun xlorlanması.*

**XLORLU** *sif.* Tərkibində xlor olan, xlorla birləşmiş olan.

**XLOROFÍL** [*yun.*] Bitkilərdə: yarpaqlara, zoğlara yaşıllıq verən və onların karbon turşusunu mənimsəməsinə kömək edən rəngləyici maddə.

**XLOROFÓRMA** [*fr.* chloroforme – qarışqa turşusu] Tərkibində xlor olan spesifik qoxulu, şirintəhər, rəngsiz maye – üzvi maddə (ümumi narkoz və ağrıkəsən dərman kimi işlədilir).

**XLORÓZ** [*yun.*] *bot.* Bitkilərdə: yarpaqlarda və zoğlarda yaşıl rəngin çatışmazlığından törəyən xəstəlik hal.

**XOCA** *is. köhn.* 1. Keçmişdə mədrəsədə təhsil alıb başına sarıq sarıyan, cübbə geyən dindar adam və ya din xadimi. *İsfahan mülkündən gələn xocalar!; Bu canımda intizarım var mənim.* Aşıq Abbas. [Naib:] *Böylə fürsət bulunur, sanma, xocam!* H.Cavid.

2. Müəllim, mürəbbi, tərbiyəçi. [Müəllim:] *Birisinin xocası siz analar, o birisinin xocası biz müəllimlər.* A.Şaiq.

**XOCAXOCA** *is. zool.* Bədənini ağlı-qaralı tük örtmüş itidimdikli köçəri quş.

**XOF** *is.* [*ər.*] Qorxu. *Qiyamət xofundan, eşq havasından; Əridi, qalmadı yağ ürəyimdə.* Aşıq Ələsgər. *Bu sözlər Lətifənin qəlbinə soxulmuş tərəddüd və xofu azaltmadı.* M.Hüseyn. [Mirzəyev Nazlıya:] *Bəs şəriət? Bəs Allah xofu? Heç mollanın sözündən*

*çıxmaq olar?* Ə.Məmmədxanlı. □ **Xof etmək (eləmək)** – qorxmaq, vahimələnmək. [Harun:] *Düşmənin zoru qabağında könül xof eyləməz.* Ü.Hacıbəyov. *Mən bu gəlişdən çox xof edirəm, ah! Başqa bir məqsədlə gəlir Bəhram şah.* A.Şaiq. [Qızı] *həyat elə mübariz, elə dava-dalaş sevən eləmişdi ki, kişilər yanından keçəndə xof eləyirdi.* S.Rəhman. **Xof götürmək** – qorxu götürmək, vahiməyə düşmək, vahimə basmaq, xoflanmaq. *Məmməd ayılıb gördü ki, Hindistan padşahının qızı Pərixanım yanındadır. Məmmədi xof götürdü.* (Nağıl). **Xofa düşmək** – qorxuya düşmək, qorxmaq, çəkinmək, sığınmaq, vahiməyə düşmək, xoflanmaq. *Mələkə xanım bu sözdən xofa düşdü.* "Qurbani". *Mən tamam ömrümdə əgər iki dəfə bərk xofa düşmüşəm, elə biri haman gün idi ki, atlı Hacı Namazalını xırmandan gəlib apardı nəçərnikin yanına.* C.Məmmədquluzadə. [Əmiraslan bəy:] *Yoxsa gopçu Ədilin sözündən xofa düşmüsünüz?* S.S.Axundov. *Firəngiz .. bəzən xofa düşüb həyəcan keçirirdi.* S.Rəhimov. **Xofa salmaq** – qorxuya salmaq, qorxutmaq, xoflandırmaq. *Oğlundan ayrılmaq* [Rüstəmi] *xofa salmağa başlayır.* S.Rəhimov. **Ürəyinə xof salmaq** – ürəyinə qorxu salmaq. *İkincisi, idarənin qabağındakı maşın* [Bayramın] *ürəyinə xof salmışdı.* Ə.Vəliyev.

**XOF-XƏTƏR** *is.* [*ər.*] Təhlükə, qorxu, təhlükə doğuracaq şey; qada-bəla. *Xof-xətərdən qurtarmaq. – Hamının qəlbindən xof-xətər getdi və hamı* [Məhəmməd Qacarın] *qətlindən sonra asudə və arxayın nəfəs aldılar.* F.Köçərli.

**XOFLANDIRMA** "Xoflandırmaq"dan *f.is.*

**XOFLANDIRMAQ** *f.* Qorxuya salmaq, vəhmələndirmək, qorxutmaq, hürkütmək; şübhəyə salmaq.

**XOFLANMA** "Xoflanmaq"dan *f.is.*

**XOFLANMAQ** *f.* Qorxuya düşmək, vəhmələnmək, hürkmək, şübhələnmək. *Qaranlıqdan xoflanmaq. – Mirzə Cəmil fəhlələrin ən adi hərəkətindən belə xoflanır, tez-tez polis çağırıb şübhələndiyi adamların yerini ələk-vələk elətdirir.* Ə.Vəliyev. *Oğlan belə laübali bir kişinin gözlənilməz hərəkətindən və sözündən xoflandı.* Mir Cəlal.

**XOFLU** *sif.* və *zərf* 1. Xof içində, təlaş içində, şübhə içində; şübhəli. *Xoflu adam. – Xain xoflu olar.* (Ata. sözü). *Şahmar bəy gedəndən bir az sonra Fərhad və Məhərrəm daxil olurlar, xoflu, yavaşdan danışırlar...* N.Vəzirov.

2. Dəhşətli, qorxulu, vahiməli. *Pirinin səksəkəli, xoflu baxışından Umudun boğazı tıxandı, tikəsini zorla udub fikirləşdi ki, yəqin indi Pirinin ürəyi yel vurmuş yarpaq təkin titrəyir.* İ.Məlikzadə.

**xoflu-xoflu** *zərf* Qorxa-qorxa, təlaş və həyəcan içində, ehtiyatla. *Mağaza işçiləri qəzet parçasına xoflu-xoflu baxıb başlarını buladılar.* H.Seyidbəyli.

**XOFLULUQ** *is.* Xoflu olma halı. [Ataş] [Mirzə Cəmildə] *gördüyü hiyləgərliyi, xofluluğu belə yavaş-yavaş unudurdu.* Ə.Vəliyev.

**XOFSUZ** *zərf* Qorxmadan, çəkinmədən, ehtiyat etmədən. *..Cürətli, mərdanə və xofsuz söz danışmaq, nüfuzu ziyadə bir firqəni tənqid etmək ancaq Seyid kimi danişmənd və süxənvər şairlərin .. və ədiblərin şəninə gəlibdir.* F.Köçərli. // *sif.* Qorxu bilməyən, heç şeydən qorxmayan, çəkinməyən; cəsarətli, ürəkli. *Xofsuz adam.*

**XOX! (XUX!)** *dan.* 1. Hədə, qorxu mənasında işlədilən nida. *Xux, qorxdum səndən! –* [Məşədi Səftər:] *Xox, yeyərsiz məni, çox böyük adamlar gəlir.* M.Əliyev. [Camal Həsənova:] *Bura bax, ey, mənə nə eləyəcəksən? Xux, qorxdum səndən.* M.İbrahimov. □ **Xox (xux) eləmək** *dan.* – "xox" ("xux") deyərək qorxutmaq. *Hidayət, təkəbbürlə yeriyə-yeriyə .. özünü dartan oğlana tərəf əyilib, xox elədi..* B.Bayramov.

2. *məc.* Balaca bir şeydən qorxan, hürkən, çəkinən; qorxaq (adətən cəm şəklində işlənir). [Maarif müdiri:] *Rüstəm kişi, get bu demaqogiyanı başqasına gəl, mənə yox. Mən sən deyən xoxlardan deyiləm.* M.İbrahimov.

**XOXAN, XOXU** *is.* İfritə (adətən körpə uşaqları qorxutmaq üçün işlədilir). *Yum gözünü, xoxu gəlir. – Atalar .. bununla bərabər yenə tamam doğru yola girmədilər .. uşaqların başlarına vurdular, gözlərini qorxutdular, "xoxan gəldi" .. dedilər.* "Məktəb". [Yazgül:] *Ay ana, mən də eymədim, bəlkə xoxanmış.* Ə.Məmmədxanlı.

**XOKKÉY** [*ing.*] Ot və ya buz üzərində şayba və ya top ilə iki komanda arasında oynanılan idman oyunu. *..Xokkey, xizək sürmək, ovçuluq, spininq* (*stolüstü raket oyunu*), *boks, avtomoto, su polosu və başqa idman növləri də insan orqanizminə çox yaxşı təsir edir.* Ə.Babayev. *Mən dözərəm birtəhər, əldən versək tennisi; Basketbolu, xokkeyi, Ancaq ar gəlir mənə; Şeir-sənət yolunda birinci görməyəndə; on min yaşlı ölkəni.* X.Rza.

**XOKKEYÇİ** *is.* Xokkey oyunçusu. *Xokkeyçilərin final turniri.*

**XOLERİK** *is.* [*yun.*] Nitqində, hərəkətində aydın təzahür edən qızğın hissiyyatlı adam.

**XOLESİSTÍT** [*yun.*] *tib.* Öd kisəsinin iltihabı.

**XOLESTERÍN** [*yun.*] Canlı toxumalarının tərkibində (o cümlədən əsəb toxumasında, öddə, dəri piyində) olan sterin qrupundan üzvi birləşmə, maddə.

**XONÇA** *is.* Şirniyyat, meyvə və s. yeməli və ya başqa hədiyyələr qoyulmuş bəzəkli podnos, tabaq və s. *Yüzlərlə gözəl cariyələr əllərində əlvan yeməklər dolu xonçalar içəri daxil oldu.* M.S.Ordubadi. *Bir tərəfdə Aslan bəy qabağında bir neçə xonça oturmuş, Əsəd bəylə söhbət edir.* C.Cabbarlı. *Hər təmiz süfrədə neçə nemət var; Xonçalar bəzənir rəngbərəng şamla.* S.Vurğun. ☐ **Xonça kimi** – al-əlvan, ala-bəzək, bərbəzəkli. *Parçanın xonça kimi gülləri. – Divarı və qapı səqfini örtən qol-budaqlı tənəyin xonça kimi şax yarpaqlarını görəndə barmağını dişlədi.* Mir Cəlal. **Xonça tutmaq –** podnosa müxtəlif şeylər qoyub bəzəmək. *Bayram xonçası tutmaq. – Şahvələd gözəl bir xonça tutub bir imansız qarı tapıb xonçanı göndərdi Şahsənəm üçün.* "Aşıq Qərib". *Xonça tutub göndərərəm sənin də öz payını; Sən də artır öz əlinlə zəfərlərin sayını!* S.Vurğun. // *etnoqr.* Adətə görə toyda, nişanda içərisinə şirniyyat, paltar, parça-qumaş, qızıl-gümüş və s. qoyulub bəzədilmiş və üstü qırmızı parça ilə örtülü podnos və s. *Qız evinə xonça aparmaq. – Bir ildən sonra oğlan evi qız üçün paltar hazırlayıb qırmızı xonçalara qoyar və qız evinə aparardı.* H.Sarabski. *Qumru, gəlinin paltarı qoyulmuş xonçanı, başqa arvad isə yer-yemiş olan xonçanı başında aparırdı.* Ə.Abasov. *Bütün bayramlarda oğlan evindən qız evinə hədiyyələr, xonçalar getməliydi.* B.Bayramov.

**XONSA** *sif.* Hər iki cinsin əlamətləri olan canlı. ☐ **Xonsa etmək** – axtalamaq. *Afrika ölkələrində yaşayan müsəlmanlardan bir qismi azyaşlı, günahsız oğlan uşaqlarını tutaraq rəhmsizliklə xonsa edir və onları müsəlmanlar yaşayan başqa ölkələrdə satırlar.* M.F.Axundzadə.

**XONSALIQ** *is.* Xonsa olma, iki cinsin əlamətini daşıma.

**XOR**[1] [*yun.*] Hər hansı vokal əsəri bir vaxtda ifa edən oxuyanlar dəstəsi. *Xor dəstəsi. Uşaq xoru.* – [Müəllif:] *Biz də yoldaşlarımızla xor təşkil edirik.* T.Ş.Simurq. [Rüstəm kişi:] *Briqadir Şirzadın yaxşı səsi var. Xor dərnəyi düzəltməyi ona tapşırmalı.* M.İbrahimov. // Kollektiv tərəfindən ifa edilmək üçün yazılmış musiqi pyesi. *Xoru çox gözəl ifa etdilər.*

**XOR**[2]**: xor baxmaq** – ikrahla, həqarətlə, alçaq nəzərlə, saymazcasına baxmaq, qiymət verməmək, dəyərsiz saymaq. *Xor baxarsan, ac qalarsan.* (Ata. sözü). [Əbubəkr ibn Məhəmməd Eldənizin Nizamiyə yazdığı məktubunda] *Atam da, əmim də hökumətlərini Azərbaycan xalqının qılıncları kölgəsində qurduqlarına baxmayaraq, bu xalqa xor baxdıqları üçün məhv oldular.* M.S.Ordubadi. *Faydalı bir zəhmətə heç bir zaman üstdən aşağı xor baxmaq olmaz.* S.Rəhimov.

**XORA**[1] *is.* 1. Çalınmış otun yerində bitən təzə ot, bitki və s. *Taxıl xorası. Xora sahəsindən suvarma nəticəsində yüksək arpa məhsulu götürmək olar.*

2. Axıra qalan yetişməmiş meyvə.

**XORA**[2] *is. tib.* Dəri üstündə irinli, xırda yaralar (çox vaxt "yara-xora" şəklində işlənir). *Xora basmaq. – Bu plastır* (*naftalanlı yapışqan plastırı*) *dərinin xroniki iltihabında, yara və xora üzərinə qoymaq üçün işlənir.* R.Əliyev.

**XORALI** *sif.* Çirkli, irinli yaralar basmış. *Xoralı üz. Xoralı əl. – Arxa yaralı, baş xoralı,*

*sinə cərahət; Bu zəhmət ilə cənnəti neylərsən, əmioğlu?* M.Möcüz.

**XÓRDA** [chorde – tel] 1. *riyaz.* Əyri xəttin iki nöqtəsini birləşdirən düz xətt.

2. *biol.* Bəzi heyvanların (məs., balıqların) bel sütunu fəqərəsi. *Bağırsağın arxa tərəfindən uzununa yastıqşəkilli xorda ayrılır.* M.Axundov.

**XOREOQRAFÍK** *sif.* Xoreoqrafiyaya aid, xoreoqrafiya ilə bağlı. *Xoreoqrafik səhnəciklər.*

**XOREOQRÁFİYA** [choreia – rəqs və grapho – yazıram] Rəqs sənəti. *Xalq xoreoqrafiyası. Xoreoqrafiya məktəbi. – Hər xalqın incəsənətində özünəməxsus olan milli forması xoreoqrafiya sənətində daha əyani və qabarıq bir surətdə nəzərə çarpır.* Ə.Bədəlbəyli. // Balet rəqsləri yaratma və səhnədə göstərmə sənəti.

**XORÉYA** [choreia – rəqs] *tib.* Əl-ayağın qeyri-ixtiyari titrəməsindən ibarət əsəb xəstəliyi.

**XORHAXOR** *zərf* Bərk xorultu səsi çıxararaq. [Salman:] *Qoy xorhaxor yatanlar sübh tezdən oyansınlar.* S.Rəhimov. [Canbalayev Bəyim xalaya:] *Səni bu həyatə xorhaxor yatmaq üçünmü qoyublar?* İ.Hüseynov.

**XOR-XOR** *təql.* b a x **xorultu** 1-ci mənada. *Məcidin xor-xoru Nadiri fikir və xəyalatdan ayıltdı.* B.Talıblı. □ **Xor-xor xoruldamaq** – bərk yatmaq, xorultu ilə yatmaq. *Məmmədhəsən ağanın anası Xanım xor-xor xoruldayırdı.* Çəmənzəminli.

◊ **Xor-xor qəlyan** – b a x **sulu qəlyan** ("**qəlyan**"da).

**XORÍST** [*yun.*] Xorda oxuyan, xor artisti.

**XORLAMA** "Xorlamaq"dan *f.is.*

**XORLAMAQ** *f.* Hürkmək, hürküb çəkilmək. *Bəxtiyar pambığı atdı gölə. Gölün suyu o saat köprüyüb qalxdı. Atlar bunu görən kimi, xorruyub geri çəkildilər.* (Nağıl). *Biz xeyli getmişdik ki, birdən Xanpərinin atı xorladı.* Ə.Vəliyev. // Məc. mənada. *Güvəc görməyən qazan görəndə xorlayar.* (Ata. sözü). // Çəkinmək.

**XORMEYSTER** [*yun.* xor və *alm.* meister – usta] Xor dəstəsinin rəhbəri, xor dirijoru.

**XORNA** b a x **xorultu**. *Sükutu yalnız Aslanın bərk xorna səsi pozurdu.* S.Vəliyev.

□ **Xorna çəkmək** – xoruldamaq. *Tiryəkkeş bərk xorna çəkdikdən sonra başını qaldırır.* A.Şaiq. [Firidun:] *Çayçı şagirdinin gətirdiyi bir stəkan tünd çayı içib, üst köynəyini çıxartdı, bükub başının altına qoyaraq, həsirin üstünə uzandı. Bu zaman kəndlilərdən biri uzun bir xorna çəkdi.* M.İbrahimov.

**XORT: xort düşmək –** b a x **xurt düşmək** ("**xurt**"da). *Qədim dayı yerdə bir az zarıyıb söyləndi, sonra xort düşüb yatdı.* S.Rəhimov.

**XORTDAN** *is.* Guya gecə qəbirdən xortlayaraq çıxıb yatmış adamların qanını soran, onlara pislik edən qorxunc, dəhşətli mövhum bir vücud. *Axırı biçarə ananız sizə deyirdi: – Bala, ağlama, xortdan gələr, səni aparar!* C.Məmmədquluzadə. [Əsəd:] *Bir adama deməyiniz, qəbiristanda xortdan var...* B.Talıblı. // *məc.* Görünüşcə qorxunc, insanı dəhşətə salan adam haqqında. *Xortdandı, çoxandı, qoyma, gəldi! Kirdarı yamandı, qoyma, gəldi!* M.Ə.Sabir.

**XORTLAMA** "Xortlamaq"dan *f.is.*

**XORTLAMAQ** *f.* Guya dirilmək, dirilib qəbirdən çıxmaq. [Sonanın] *qabağına kölgələr, qəbirdən xortlayan ölülər çıxmamışdı.* M.İbrahimov. [Ələmdar:] [Məşədi] *qırsaqqız oğlu qır-saqqız, elə bil o gorbagor Hacı Abutalıbın özüdür ki, qəbirdən xortduyub...* S.Rəhimov. [Molla Kərim:] *Ey insan cildinə girmiş şeytani-ləin, söylə, söylə görüm kimsən, nə günahın sahibisən və nə üçün xortdamısan?* B.Talıblı.

**XORTULDAMA** "Xortuldamaq"dan *f.is.*

**XORTULDAMAQ** *f.* Xortultu səsi çıxartmaq, xort-xort eləmək. *Donuz xortuldayır.*

**XORTULTU** *is.* Donuzların çıxardığı səs.

**XORTUM** *is.* 1. Fillərdə və bəzi başqa heyvanlarda müxtəlif vəzifələr (tənəffüs, iybilmə və s.) icra edən boru şəklində uzanan mütəhərrik ağız və ya burun qismi. *Deyən zorlu fil; Tapdağında sürüklənən bir aciz deyil; Bir gün gələr qəzəblənib tutacaq səni; Xortumunda ümmanlara atacaq səni.* A.İldırım. // *zool.* Bəzi onurğasız heyvanların bədənlərinin müxtəlif vəzifələr (ovu tutub boğma, özünü qoruma və s.) icra edən ön hissəsi və ya bu hissədəki fırlar. *Zəlinin xortumu. – Boz-qara Qafqaz arısının bə-*

*dəni başdan-başa tünd bozdur və xortumu uzundur. Bu cins arılar çox sancmır.* R.İbrahimov. *..Axşam düşürdü, elə bil, dünyanın bütün ağcaqanadlarını yığıb tökürdülər bura və ağcaqanadlar adamı yandırıb tökən, iynəli xortumlarını işə salırdılar.* İ.Məlikzadə. *Ağcaqanadlar elə sancırdılar ki, onların xortumu dəyən yer bir saat göynəyirdi.* İ.Şıxlı.

2. *tex.* Müxtəlif maşınlarda qabağa uzanmış heyvan burnunu xatırladan tutucu hissə. *Dəzgahın xortumu. – Torpağın ürəyindən ağrısını çəkir bax; Maşınlar xortumuyla qocaman fillər kimi.* S.Rüstəm. *Parovozlarla yanaşı olaraq xortumları yuxarı qaldırılmış hündür ekskavatorlar yırğalana-yırğalana irəliləyirdi.* Ə.Sadıq. // Nasos və kranlara taxılan brezent, rezin və ya başqa materialdan hazırlanmış uzun boru. *Yanğın maşınının xortumu.*

3. Səhra toplarında: lüləni əl ilə hədəfə tuşlamaq üçün top qundağının uzanan arxa hissəsi. *Mədəd, yaxında qara xortumu düşmən tərəfə uzanıb duran topa, o yanda ağ qar zəmisində girəcəkləri seçilən qazmalara baxdı.* Ə.Əbülhəsən.

**XORTUMCUQ** *is.* Balaca xortum. *Arının xortumcuğu.*

**XORTUMLU** *sif.* 1. Xortumu olan. *Xortumlu milçək. Xortumlu maşın.*

2. *dan.* b a x **qalife**. *Dağbaşev ayağa qalxıb əlini xortumlu, göy mahud şalvarının cibinə soxaraq iri addımlarla gəzə-gəzə: – Atasına od vuracağam! – dedi.* S.Rəhimov.

**XORTUMLULAR** *cəm zool.* Xortumu olan heyvanlar dəstəsi.

**XORULDAMA** "Xoruldamaq"dan *f.is.*

**XORULDAMAQ** *f.* 1. Yuxuda ikən xorultu (xor-xor) səsi çıxartmaq. *Bir azdan sonra rəfiq başladı xoruldamağa.* Ə.Haqverdiyev. *Çay hazırlanmış olduğu vaxt Murad bəy mürgüləyir, Cavad bəy xoruldayaraq yuxulayırdı.* T.Ş.Simurq.

2. *məc.* Bərk yatmaq, yuxuda olmaq. *Bahadır atlar bağlanan yerə gedib, gördü ki, Novruz xoruldayır.* N.Nərimanov. *Ara-sıra səkinin üstündə və meydanlarda uzanıb xoruldayanlara da rast gəlmək olur.* M.İbrahimov.

3. "Mır-mır" səsi çıxartmaq; mırıldamaq. *Pişik bərk xoruldayır.*

4. *məc.* Mırıldanmaq, deyinmək, donquldanmaq. [Cənnətəli ağa:] *Belə iş olarmı, ay camaat, .. həm darımı yesin, həm də mənə xoruldasın.* N.Vəzirov.

**XORULTU** *is.* 1. Xor-xor səsi, yuxuda ikən xoruldayan adamın çıxardığı səs. [Kişilərin] *xorultusu hamamı bürümüşdü və qıllı sinələri körük kimi enib qalxırdı.* Çəmənzəminli. [Qaraşın] *gecənin pozulmaz sükutu arasında iki otaq o yanda atasının xorultusu qulağına gəldi.* M.İbrahimov. *Çərkəzin xorultusu mışıltıya çevrilmişdi.* İ.Şıxlı. // Pişik haqqında. *Pişiyin xorultusu.*

2. Mırıltı. [Kərim babanın atası:] *..Çarəsiz mağaraya girdim, bir də ağır bir xorultudan gözlərimi açdım.* A.Şaiq.

**XORUM** *is.* Bir dəfə üçün heyvana verilən yem, yem norması, yem miqdarı. *Bütün dünya od tutub yansa, bizim ki bir xorum otumuz yanmayacaq?* Ə.Vəliyev.

**XORUMLAMA** "Xorumlamaq"dan *f.is.*

**XORUMLAMAQ** *f.* Xorum-xorum ayırmaq, paylara bölmək; dəstələmək. *Qara camış vən, vələs, ağcaqayın şivlərini əyəndə, Ala dana onların yaşıl yarpaqlarından xorumlayıb ötürürdü.* S.Rəhimov. *İgidlər var ki, bir gündə yüz bağ otu lay qoruyub xorumlayır, bağlayır.* Ə.Vəliyev.

**XORUZ** *is.* 1. Toyuğun erkəyi. *Kənd tamamilə yuxudan oyanmışdısa da xoruzlar səs-səsə verib banlaşırdılar.* Ə.Vəliyev. *Bütün həyətlərdə kəndin xoruzları banlaşırdı.* Ə.Məmmədxanlı. // Toyuq cinsindən bəzi quşların erkəyi. *Qırqovul xoruzu.* – [Ovçu:] *Ancaq bircə şərtim var: təkcə xoruzları vuracayıq.* M.Rzaquluzadə.

2. *məc. dan.* Dalaşqan, davakar, savaşqan adam haqqında. □ **Xoruz kimi** – 1) sifəti qıpqırmızı, sağlam adam haqqında. *Xoruz kimidir;* 2) davakar, dalaşqan, döyüşkən (adam). [Hürü:] *Nə olacaq, dəli qudurmuş atan təzədən genə çarxı xoruz kimi girib meydana, qoymaz görək dərdimiz nədir?* N.Vəzirov.

◊ **Xoruz banı** – sübh tezdən, alaqaranlıq. *Üçüncü xoruz banı gecədən xeyli keçdiyini xəbər verdi. Heç kəs yatmaq istəmirdi.* R.Rza. *Səhər* [yolçu] *xoruz banında ayıldı.* Ə.Məmmədxanlı. **Xoruz banına kimi**

**(qədər)** – səhərə kimi, işıqlaşana qədər. *Aralarında heç bir inciklik olmayıbmış kimi, ata ilə oğlunun şirin söhbəti xoruz banına kimi uzandı.* Ə.Abasov. **Xoruz səsi eşitməmiş (eşitməyən)** – heç kəsin bilmədiyi, eşitmədiyi, görmədiyi, təptəzə. *Sən özün bilirsən ki, mən həmişə elə söz deyirəm ki, qəribə olsun, təzə olsun, heç kəsin eşitmədiyi, bilmədiyi, danışmadığı olsun. Xoruz səsi eşitməmiş söz olsun.* "Mol. Nəsr.". *Hər gün bu kimi yeni-yeni xoruz səsi eşitməyən xəbərləri alan telefonçu Əsgər, öz dostlarının qabağında xəcalət çəkməzdi.* S.Rəhimov. **Xoruza yükləmək, xoruza yük eləmək** – var-yoxunu əlindən almaq, müflis eləmək, soymaq. [Ağa Kərim xan:] *A gədə, Səfərəli, sənin qəsdin, balam, odur ki, məni xoruza yükləyəsən.* N.Vəzirov. [Səlim bəy Nəcəf bəyə:] *Gəlmişəm görüm, səni də bir xoruza yükləyə bilərəmmi?* Ə.Haqverdiyev. *Gör hələ bunları necə xoruza yükləyəcəyəm.* S.Rəhimov. **Xoruzu qoltuğuna verilmək** – qovulmaq, işdən qovulmaq. *Müdirin də xoruzu; Verildi qoltuğuna; Peşiman oldu özü; Bu müdir olduğuna.* Ə.Cavad. **Xoruzun quyruğu görünür** – aşkar olur, üstü açılır, görünür (gizli saxlanılmalı olan şey haqqında). [Qərib:] *Yox əşşi, burda xoruzun, vallah, quyruğu görünür.* Ə.Əbülhəsən. **Xoruzunu qoltuğuna vermək** – qovmaq, işdən qovmaq. [Xəlfə:] *Süleymanı bu vaxtadək heç bir yıxan olmamışdı,* [Dursun] *elə verdi xoruzunu qoltuğuna..* C.Cabbarlı.

**XORUZBAZ** *is.* Köhnə məişətdə: bir əyləncə kimi döyüşdürmək üçün xoruz saxlayan və bu işlə məşğul olan adam. *Məktubunda yazırsan ki, qəsəbənizin əhalisi xoruzbazların, qoçbazların və itbazların əlindən cana-bezara gəlmişdir.* "Kirpi".

**XORUZBAZLIQ** *is.* Köhnə məişətdə: döyüşdürmək üçün xoruz saxlama və bir əyləncə kimi xoruz döyüşdürməklə məşğul olma. *Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini quşbazlıq, tazıbazlıq, xoruzbazlıq və bu kimi işlərə verərdi.* H.Sarabski.

**XORUZBEÇƏ** *is.* 1. Cavan xoruz, çolpa. [Aftil Hacı Əhmədə:] *Budur, sən hər gün xoruzbeçə yeyirsən, mənim uşaqlarım bir çuxur bulama da tapa bilmir.* C.Cabbarlı. [Rüstəm Səkinəyə:] *Qaraşı çağır, qoy xoruz-beçədən də üç-dördünü kəssin, çığırtma düzəlt.* M.İbrahimov.

2. *məc.* Qışqırıqçı, davakar. [Fatma xanım:] *Səni öyrədənin ciyəri dağlansın, mənə xoruzbeçə deyirsən!* N.Vəzirov.

**XORUZGÖZ** *sif.* Yetkin, cavan, yeniyetmə; zirək. *Çay aşağı getmərəm; Çadramı yellətmərəm; Xoruzgöz oğlan gərək; Dul kişiyə getmərəm.* (Bayatı). [Həcər:] *Mənə xoruzgöz, bığıburma .. bir oğlan lazımdır.* "Həcər xanım".

**XORUZGÜLÜ** *is. bot.* Tünd-qonur rəngdə yoğun və qısa kökümsov gövdəsi olan irisalxımlı, sarıçiçəkli çoxillik bitki. *Xoruzgülü çoxillik bitki olub, tünd-qonur, yoğun və qısa kökümsov gövdəyə malikdir. Yarpaqlarının kənarı hamardır. Gövdəsinin təpələrində yerləşmiş qızılı sarı rəngli böyük və gözəl çiçəkləri vardır.* R.Əliyev. *..Bəhərli qara tut ağaclarının ətrafındakı ləklərdə xoruzgülü, mixəkgülü şitilləri əkilmişdi.* İ.Qasımov.

**XORUZQUYRUĞU** b a x **xoruzpipiyi**. *Bir neçə dəqiqədən sonra iki stəkan xoruzquyruğu çay gəldi.* M.Hüseyn.

**XORUZLANMA** "Xoruzlanmaq"dan *f.is.*

**XORUZLANMAQ** *f.* Kişilənmək, kəkələnmək, şəşələnmək; qızışmaq, özündən çıxmaq. [Güldəstə:] *Hünərindi get, bu sözləri Rzaquluya de. Bizim yanımızda xoruzlanmaq bir çətin iş deyil.* N.Vəzirov. *Məsələnin nə yerdə olduğunu bilmək istəmədən Qüdrətin üstünə xoruzlanan Mirzəyevi buradakılardan heç birinin görən gözü yox idi.* M.Hüseyn.

**XORUZPİPİYİ** *sif.* Qırmızı, pürrəng. *Qarının buğlana-buğlana gətirdiyi qayğanaqdan doyunca yedilər, onun da üstündən iki-üç stəkan xoruzpipiyi çay içdilər.* M.Hüseyn. *Üç yoldaş termosdan tökdüyümüz buğlanan tünd "xoruzpipiyi" çaydan içə-içə söhbət edirdik.* M.Rzaquluzadə.

**XORVAT** *is.* Yuqoslaviyanın tərkibinə daxil olan Xorvatiyanın əsas əhalisini təşkil edən cənubi slavyan xalqı və bu xalqa mənsub adam.

**XORVATCA** *sif.* və *zərf* Xorvat dilində. *Xorvatca kitab. Xorvatca danışmaq.*

**XOSUNLAŞMA** *is. dan.* 1. "Xosunlaşmaq"dan *f.is.*

2. Gizli danışıq, pıçapıç, dedi-qodu. [Qəhrəman:] *Ancaq orada xosunlaşma, ümumi işi axsatmaq olmasın.* Ə.Vəliyev.

**XOSUNLAŞMAQ** *f. dan.* Heç kəsə eşitdirmədən bir-birilə gizli-gizli, pıç-pıç danışmaq, pıçıldaşmaq. *Gün çırtadı, göz qamaşdı; Araz mənlə xosunlaşdı..* Şəhriyar. *Əlində çatı, buzovu mala qatan arvadlar bir-birini görən kimi xosunlaşırdılar.* İ.Şıxlı.

**XOŞ** *sif.* [*fars.*] 1. Ürəyəyatan, xoşlandıran, xoşagələn, bəyənilən, yaxşı, gözəl. *Xoş xasiyyət. Xoş təbiət. Xoş səda.* – [Quşların] *..xoş avazları cütçünü həvəsə gətirdi.* S.S.Axundov. [Xədicə] *olduqca xoşsöhbət, eyi təbiətli, geniş qəlbli, munis və mehriban bir qız idi.* S.Hüseyn. *Yazın ilıq nəfəsində; Yasəmənin xoş ətri var..* N.Rəfibəyli. // Ruhu oxşayan, ləzzət verən, səfalı, nəşəli. *Xoş bir yel insanı oxşayır, köksünə sirli bir fərəh doldururdu.* Çəmənzəminli. *Buradan binanın o biri həyatinə xoş bir mənzərə açılırdı.* M.Hüseyn. *Günortaya qədər ürəkaçan xoş bir hava vardı.* M.Rzaquluzadə. // Mehriban, könlü oxşayan, ürəyəyatan. *Xoş baxış.* – *Tanrı səni xoş cəmala yetirmiş; Səni görən aşıq əqlin itirmiş.* Qurbani. *Eldarın xoş bir əda ilə: – Buyurun, buyurun! – dediyini eşitdim.* M.Rzaquluzadə. *Mehriban əlində tayqulp uzaqdan xoş dillə sözə başladı.* M.Süleymanov. // Gözəl, yaxşı, fərəhli, xoşbəxt. *Xoş gələcək. Xoş dövran. Xoş çağ.* – *Gör dünənim hara, bu günüm hara; Aparır daha xoş gözəl çağlara.* B.Vahabzadə.

2. **Xoşa** şəklində *klas.* – b a x **xoş halına!** *Xoşa o aşiqə kim, məclisində yarı ola; Vüsali-yardə fərxəndə ruzigarı ola.* S.Ə.Şirvani.

3. **Xoşdur** şəklində – yaxşıdır, gözəldir. [Nüşabə:] *Belə işlərdə mətanət xoşdur; Hələlik incə siyasət xoşdur.* A.Şaiq. *Xoşdur səhər nəğməsi; Səhərin oyaq səsi; Axşamın havasından!* M.Müşfiq.

4. **Xoşla** şəklində *zərf* – könüllü (olaraq), zorsuz, öz razılığı ilə, öz xoşu ilə. *Xoşla iş görmək.* – [Daşdəmir İnciyə:] *Səni onsuz da Aydəmirə xoşla verməyəcəklər.* C.Cabbarlı. [Baxış bəy] *istər zorla, istər xoşla ələ saldığı adamların sayını artırmağı özünə xüsusi məharət və şöhrət sanırdı.* Ə.Abasov.

◊ **Xoş gəldin** – 1) biri ilə görüşəndə, bəzən də ayrılanda işlədilən ifadə. *Əzizim, səfa gəldin; Xoş gəldin, səfa gəldin; Nə mən öldüm qurtardım; Nə sən insafa gəldin.* (Bayatı); 2) çıx get, rədd ol, gedə bilərsən mənasında ifadə. [Yaşlı kişi:] *Əgər həmin qulluqçu ikinci dəfə də belə bir unutqanlıq etsə idi,* [tacir] *haqq-hesabını verməklə "xoş gəldin" deyib qovardı.* S.Hüseyn. **Xoş gəlibsən (gəlmisən); xoş gəlib, səfa gətirmisən** – gələnə söylənilən mehriban salam ifadəsi. [Mirzə Mustafa:] *Sən xoş gəlmisən, əzizim, səfa gətirmisən.* E.Sultanov. [Yusif:] *Xoş gəlibsən, Pərzad nənə.* N.Nərimanov. [Nisəbəyim xanım:] *Əleykəssalam, xoş gəldin, səfa gətirdin. Əyləş görək, balam, sən hara, bura hara.* M.S.Ordubadi. **Xoş gəlmək** – b a x **xoşuna gəlmək**. [Asya:] *Yox, yox, çox xoş gəlir. Elə ona görə də məni bir sayaq qəm basır, qüssə eləyirəm.* Ü.Hacıbəyov. *Qocadan eşitdiyi bu tərif Nərgizə elə xoş gəldi ki, burnunu çəkib başını uca tutdu.* Ə.Məmmədxanlı. **Xoş gördük!** – salam ifadəsi. [Atakişi:] *Babakişi, sənsən? A kişi, xoş gördük, dayan bir səni qucaqlayım..* C.Cabbarlı. [Gülara:] *Xoş gördük, vəfasız dost!* İ.Əfəndiyev. [Nisə xanım:] *A, xoş gördük Ayaz!* Ə.Məmmədxanlı. **Xoş halına!** – bəxtəvər, bəxtəvər başına (istehza ilə). [Nazlı:] *Dayə, – dedi, – xoş halına. Yaxşı ki, o mələk sənin qəlbini viranə bağa döndərməmişdir...* Çəmənzəminli. [Gülöyşə Hidayətə:] *Vallah, yaxşı oğulsan, xoş halına Çiyələyin.* B.Bayramov. **Xoş keçmək** – çox yaxşı keçmək, şən keçmək, rahat keçmək. *Nə xoş keçir bu şən gün; Atlanan gün, düşən gün; Ağlım başımdan oynar; Yar yadıma düşən gün.* (Bayatı). *Quzu mələr yaylağında; Xoş keçir halı dağların.* Aşıq Şəmşir. **Xoşa gəlmək** – bəyənilmək, ürəyə yatmaq, ləzzət vermək. *Kəklik kimi sən qəhqəhə çalanda; Xoşa gəlir o səndəki dil, Cahan!* Aşıq Abdulla. **Xoşuna (xoşu) gəlmək** – bəyənmək, ürəyincə olmaq, ürəyinə yatmaq. [Məşədi İbad:] *İndi mən papağımı nə cür qoyum ki, qızın xoşuna gəlsin?..* Ü.Hacıbəyov. *Təzə*

*qırmızı donu Nərgizin çox xoşuna gəldi.* Ə.Məmmədxanlı.

**XOŞAB** *is.* [*fars.*] Su və şəkərlə bişirilmiş meyvəli şərbət; kompot. *Fikirləşirlər ki, həmin pula bir küpə xoşab alsınlar ki, aparıb kənddə satsınlar.* "M.N.lətif."

**XOŞAGEDƏN** bax **xoşagələn**.

**XOŞAGETMƏZ** *sif.* və *zərf* Xoşa gəlməyən, ürəyə yatmayan, arzuedilməz; pis, çirkin. *Xoşagetməz hadisə. Xoşagetməz hərəkət. Xoşagetməz səs.*

**XOŞAGETMƏZLİK** *is.* Xoşa getməmə; xoşagetməz şeyin halı.

**XOŞAGƏLƏN** *sif.* Ürəyəyatan, insanda xoş əhval-ruhiyyə yaradan, xoş, bəyənilən. *Xoşagələn şeir. Xoşagələn parça seçmək. – Qoltuğunda kitablar, körpə qəlbində qəmlər; Qiymət dəftərçəsində xoşagələn rəqəmlər.* S.Rüstəm. [Əlikram:] *Dil ətdəndir, Şeyda, o qədər xoşagələn söz, fikir demək olar ki...* B.Bayramov. // Gözəl, qəşəng, məlahətli. *Xoşagələn səs.*

**XOŞAGƏLİM(Lİ)** *sif.* Gözə xoş gələn, xoşsifət, qanışirin, gözəşirin, yapışıqlı. [Qızın] *ağ, xoşagəlim sifəti, qaynar ala gözləri vardır, kiçik burnunun ucu azca yuxarı dikəlmişdir.* V.Şıxlı. // Gözəl, qəşəng. *Xoşagəlim mənzərə. Xoşagəlim yer. Xoşagəlim səs.*

**XOŞAGƏLİMLİLİK** *is.* Xoşagəlimli şeyin, ya şəxsin halı; gözəllik, qəşənglik, cazibədarlıq; cazibə, məlahət.

**XOŞAGƏLMƏYƏN** bax **xoşagəlməz**. [Fərrux və Qurban] *tez-tez xoşagəlməyən, ürəkbulandıran xəbər eşidirdilər.* Ə.Vəliyev.

**XOŞAGƏLMƏZ** *sif.* Xoşa gəlməyən, istənilməyən, bəyənilməyən, arzu edilməyən, adamda pis təsir oyadan; xoşagetməz, iyrənc, çirkin. *Xoşagəlməz hadisə. Xoşagəlməz hərəkət. – Cahandar ağa Əşrəfin bu işlərə necə münasibət bəsləyəcəyini bilməsə də, hər halda xoşagəlməz, könül bulandıran söhbət eşitmək istəmirdi.* İ.Şıxlı.

**XOŞAGƏLMƏZLİK** *is.* Xoşa gəlməyən şeyin halı; pislik, çirkinlik.

**XOŞAHƏNG** *sif.* [*fars.*] Aralarında xoş, uyğun ahəng, uyğunluq olan. *Xoşahəng səslər.*

**XOŞAHƏNGLİK** *is.* Aralarında xoş ahəng, uyğunluq, müvafiqlik. *Boyaların xoşahəngliyi. Avazın xoşahəngliyi. – Bir neçə müxtəlif və əlvan rəngin xoşahəngliyi .. də rəng estetikasına aiddir.* A.Qazıyev.

**XOŞAXOŞ** *zərf* Öz xoşu ilə, istəyərək, həvəslə, ürəklə. *Xoşaxoş deyilənə əməl etmək.*

**XOŞAXOŞLUQ, XOŞAMXOŞLUQ** *zərf* Öz xoşu ilə, istəyilə, könüllü olaraq, istəyərək. [Sultan bəy:] *Süleymanı görsəm deyəcəyəm ki, Əsgərə xəbər versin ki, gəlib qızı götürüb qaçsınlar; yoxsa, görünür ki, xoşaxoşluq ilə getməyəcəkdir.* Ü.Hacıbəyov. [Hacı Əli:] *Hörmətli ağalar! Məmmədəli Mirzəyə məşrutəni elan etməkdən çətin dərd ola bilməz. O, xoşamxoşluq ilə bu işi etməyəcəkdir.* P.Makulu.

**XOŞALLANMA** "Xoşallanmaq"dan *f.is.*

**XOŞALLANMAQ** *f.* Bir şeydən xoş təsir duymaq, ləzzət aparmaq, nəşə duymaq, xoş hisslər duymaq. *Oğlan yeyə-yeyə qulaq asır, qəlbində xoşallanır, sevinirdi.* Çəmənzəminli. *Bu şaxtalı gecənin yarısında od onları xoşallandırdı.* S.Rəhimov. [Budaq:] *Anam əllərini gəzdirdikcə yorğunluğum çıxır, xoşallanırdım.* Ə.Vəliyev.

**XOŞALMA** "Xoşalmaq"dan *f.is.*

**XOŞALMAQ** *f.* Xoş olmaq, yaxşılaşmaq, mülayimləşmək. *Bəziləri bu il havaların birdən-birə xoşalıb qızışmasını yazın tez gəlməsi kimi izah edir.* M.İbrahimov.

**XOŞAM-XOŞAM** bax **xoşaxoşluq**.

**XOŞAVAZ(LI)** *sif.* [*fars.*] Məlahətli səsi olan, xoşsəsli, gözəl səsli. [Çaqqal:] *Dedi kim, ey xurusi-xoşavaz; Düş aşağə, qılaq xudaya namaz.* S.Ə.Şirvani. *Məşədi İsmayıl xoşavaz bir adamdır və ucadan "Mahur" havasilə "putuluk, fusuluk" oxuya-oxuya küçələri dolanar.* C.Məmmədquluzadə. *Mən nə bilim qarğa xoşavazmış? Bayquşa bayquş demək olmazmış?* M.Möcüz.

**XOŞAVAZLIQ** *is.* Xoşsəslilik, səsdə məlahət.

**XOŞ-BEŞ** *is.* Salamlaşma zamanı bir-birindən kef-əhval soruşma. *Xoş-beşdən sonra qonaq Ataşın əmisinin adını çəkib ondan gətirdiyi kağızı verdi.* Ə.Vəliyev. [Hacı Ağakərim:] *Bəs sənin dayına salamın, xoş-beşin hanı, ədəbsiz!* S.Rəhman. [Vahidov Şeydaya:] *Xoş-beşin sonraya qalsın.* Ə.Məmmədxanlı. ☐ **Xoş-beş etmək**

**(eləmək)** – salamlaşmaq, kef-əhval soruşmaq. [Qoca nəvəsinə:] *Ta onda nə durub üzümə baxırsan, xoş-beş elədik, bəsdir, get işində ol, çünki bu dünyada hər şeydən birinci işdir...* Ə.Məmmədxanlı. *Ağsaqqal həkim tez otağa girdi, Nənəqız ayağa qalxdı və ona xoş-beş elədi.* S.Rəhimov. [Müəllim] *Büləndlə xoş-beş etdikdən sonra yenə qayıdıb öz işinə məşğul oldu.* Ə.Əbülhəsən.

**XOŞBƏXT** *sif.* [*fars.*] Bəxti gətirmiş, taleli, bəxtli, sevinc və rifah içində yaşayan. [Ağca xanım Qaraca qıza:] *Ah, sən xoşbəxt uşaqsan. Mənim kimi dustaq olmayıb özün üçün bağda azad gəzirsən.* S.S.Axundov. [Hacı:] *Bir övrət, bir qızım, iki cavan oğlum, özüm xoşbəxt.* C.Cabbarlı. *Dünyada sanardım əbədi ömrümü xoşbəxt; Öpsəydim əgər bir də mübarək qədəmindən.* Ə.Vahid. // Bəxti gətirən, uğurlu. *Xoşbəxt oyunçu. Xoşbəxt adamdır.* // Məsud, bəxtəvər, səadətli. [Xaqani:] *Mən sənin eşqinlə qanadlanıram; Səninlə özümü xoşbəxt sanıram.* M.Rahim □ **Xoşbəxt etmək** – xoşbəxtliyə, səadətə çatdırmaq, səadət vermək, məsud eləmək. *Uşaqlarını xoşbəxt eləmək.* – [Lütfəli:] *Gözəl Şəfiqə, səni sevirəm, məni xoşbəxt elə.* İ.Musabəyov. [Muxtar Firəngizə:] *Mən heç güman eləmirəm ki, .. böyük vəzifədə olan arvad ərini xoşbəxt eləyə bilsin.* B.Bayramov. □ **Xoşbəxt olmaq** – istəyinə çatmaq, arzusu yerinə yetmək, məsud olmaq, ürəyində nisgil qalmamaq. **Xoşbəxt ol (olsun, olsunlar)** – xoşbəxtlik, səadət arzusu bildirir. [Bəhram:] *Sara üçün də bir yaxşı ər tapmağa səy edərəm ki, o da xoşbəxt olsun.* C.Cabbarlı. [Vaqif:] *Allah başa versin, xoşbəxt olun siz! Belə, kəklik kimi cüt gəzəsiniz.* S.Vurğun. [Ana:] *Hamının yanında qızlarımı təriflədi: – Ağıllı uşaqlardır. Xoşbəxt olsunlar!* M.Hüseyn. **Allah xoşbəxt eləsin!** – səadət, xoşbəxtlik arzusu. *Şükufələnmiş güllər nəsimin dəyməsindən enib-qalxdıqca Gülsümün vidasına cavabən* "*Get, Allah səni xoşbəxt eləsin!*" – *deyirdilər.* Ə.Haqverdiyev. [Səlim qızına:] *Get, qızım, Allah səni xoşbəxt eləsin.* C.Cabbarlı.

2. Xoş, uğurlu. [Dürrətülbağdad:] *..Hazırda möhtərəm Fəxrəddinin gəlməsi ilə özümü Bağdadın ən xoşbəxt qadını hesab edirəm.* M.S.Ordubadi.

**XOŞBƏXTLİK** *is.* 1. Həyatından son dərəcə məmnunluq, dərin razılıq və sevinc hissi, səadət. *Ailə xoşbəxtliyi. Xalqın xoşbəxtliyi.* // Bu hissin bu və ya başqa bir şəkildə təzahürü. *Əziz balalar! ..Mində birimizin üzünə xoşbəxtlik günü doğub minmin bəlalərdən xilas olub da hazırdakı dərəcəyə çatdıq.* N.Nərimanov. *Ağabalanın bu xoşbəxtliyinə bütün şagirdlər həsəd apardı.* Çəmənzəminli. [Qətibə:] *Bugünkü vəziyyətin şəklini dəyişmədən xoşbəxtlik məsələsini meydana atmaq xəyalpərəstlikdir, hissiyyatpərvərlikdir, bunların heç birisindən xoşbəxtlik ummaq olmaz.* M.S.Ordubadi. □ **Xoşbəxtlik üz vermək** – taleyi gətirmək, bəxti gətirmək, bəxti üzünə gülmək. [Tapdıq:] *Bəlkə yenə xoşbəxtlik üz verdi.* Ə.Əbülhəsən. *Qafar Xəlilova 1951-ci ildə böyük xoşbəxtlik üz verdi.* Ə.Sadıq.

2. **Xoşbəxtlikdən** şəklində ara s. mənasında – məmnunluq ifadə edir. *Xoşbəxtlikdən, heç kəsə xətər toxunmadı. – Kosa yerə çöküb o tərəf-bu tərəfə boylandı, xoşbəxtlikdən, heç kəs onu görməmişdi.* S.Rəhimov. *Xoşbəxtlikdən, gəmidə mama tapıldı.* S.Vəliyev. *Bu dəfə, xoşbəxtlikdən, Zərqələmin anası da qızının uşaq evinə getməsinə razılıq verdi.* Ə.Sadıq.

**XOŞBƏNİZ** b a x **xoşsifət(li)**.

**XOŞBU(Y)** *sif.* [*fars.*] *klas.* Xoşiyli, ətirli, rayihəli, ətirsaçan. *İstəmən firdos bağinin güli-xoşbusini; Dünya bağında güli-ruxsarin ondan yaxşıdır.* Xətayi. *Seyr qıl arizini, kim güli-xoşbu kimidir; Bədəni naziktər, sinəsi pərqu kimidir.* Aşıq Pəri.

**XOŞCA** *zərf* Xoş, xoşa gələn tərzdə. *Xoşca gülümsəmək. Xoşca danışmaq. Xoşca bir söz demək.*

**XOŞÇƏKİM(Lİ)** *sif.* Çəkiləndə xoş təsir bağışlayan, ləzzət verən, nəşə verən. *Mən də* [papirosun] *birini eşdim. Doğrudan da, tütün çox ətirli və xoşçəkim idi.* M.Rzaquluzadə.

**XOŞDİL(Lİ)** *sif.* Dili xoş, şirindilli, ürəyiaçıq. *..Hamı müsəlmanlar sənin kimi .. xoşdil ola idilər.* Ü.Hacıbəyov.

**XOŞƏHVAL(LI)** *sif.* [*fars.* xoş və *ər.* əhval] Xoşxasiyyətli, xoştəbiət, yumşaq, xoşqılıq,

əhvallı. *Xoşəhvallı adam. – Mirzə Abbasqulu ortaboylu, xoşsifət, xoşəhval və şirinsöhbət bir kişi idi.* M.Tahirli.

**XOŞƏXLAQ(LI)** *sif.* Yaxşı əxlaqlı, gözəl xasiyyətli, xoşxasiyyət. *Xoşəxlaq adam.* – [Rza:] *Xoşəxlaq, ünsiyyət sevən, zəhmətə dözən olduğundan heç kəs ondan pis bir söz danışmazdı.* M.İbrahimov.

**XOŞƏXLAQLILIQ** *is.* Xoşəxlaq adamın keyfiyyəti, əxlaq gözəlliyi, əxlaqca yaxşılıq.

**XOŞƏMƏL** *sif.* Təmiz, əxlaqlı. *Xoşəməl adam.*

**XOŞƏTİR** [*fars.* xoş və *ər.* ətr] bax **xoşbu(y)**.

**XOŞFİKİR(Lİ)** [*fars.* xoş və *ər.* fikir] bax **xoşniyyət(li)**.

**XOŞGƏLDİN: xoşgəldin eləmək** – gələnə "xoş gəldin!" deyərək salamlaşmaq. [Nuriyyə:] *Əynində güllü xalat, başında ağ haşiyəli bənövüş kəlağayı, .. yumru bir qadın qabağımıza yeriyərək mənə xoşgəldin elədi.* İ.Əfəndiyev. *Tahirzadə elə bil çoxdan dayanıb onları gözləyirdi. Xoşgəldin elədi.* Mir Cəlal. *Qonaq ilə ev sahibi yerlərində oturandan sonra əvvəlcə sərdar qonağa xoşgəldin elədi.* P.Makulu.

**XOŞGÖFTAR** [*fars.*] bax **xoşkəlam**.

**XOŞGÜN(LÜ)** bax **xoşgüzəran(lı)**.

**XOŞGÜZƏRAN(LI)** *sif.* [*fars.*] Güzəranı, həyatı xoş keçən, yaxşı yaşayan. [Hacı Kərim zərgər:] *Cənab şair, bərfərz ki, bizim hər birimizdə bir təqsir var ki, sənətindən bəhrəyab olmur, bəs sən niyə öz sənətindən xoşgüzəran deyilsən?* M.F.Axundzadə.

**XOŞHAL** *sif.* [*fars.* xoş və *ər.* hal] Halı, əhvalı xoş olan; şad, məmnun, razı. *Çox olduqca qəmü dərdim, rəhi-eşq içrə xoşhaləm.* Füzuli. [Zeyd:] *Harun, bu nə haldır? Söylə, nə əhvaldır? Leyla sənin ilə bir yerdə; Məşğuli-xoşhaldır.* Ü.Hacıbəyov. // *zərf* Mehribanlıqla, mülayim bir tərzdə. *Kapitan gözaltı Kəyanə baxdı, onu utandırdığını sezdiyindən, xoşhal dönüb Cumaya əmr etdi.* Ə.Əbülhəsən. ☐ **Xoşhal etmək (eləmək, qılmaq)** – könlünü, xatirini xoş etmək, kefini açmaq, şadlandırmaq. *Nədir qılmaz məni xoşhal dilbər bir pəyam ilə; Qəmindən sübh olunca qaldığım bidar bilməzmi?* S.Ə.Şirvani. *Komediyada oynayan cavanların cümləsi öz rollarını yaxşı yerinə yetirib, tamaşaya cəm olanları ziyadə fərəhnak və xoşhal etdilər.* F.Köçərli. [Rüstəm bəy Sofyaya:] *Niyə kədərlənməyim ki, gözümün işığı kimi istədiyim bir dilbəri şerimlə xoşhal edə bilmədim.* Çəmənzəminli. **Xoşhal olmaq** – qəlbi, ürəyi açılmaq, sevinmək, şad olmaq. *Həkim babanın nəvənəticəsi bu xəbərdən çox xoşhal oldu.* S.Rəhimov. *Rzanın xoşhal olduğunu görüb, Orxan tərifi bir az da artırdı.* İ.Məlikzadə.

**XOŞHALLANDIRMA** "Xoşhallandırmaq"-dan *f.is.*

**XOŞHALLANDIRMAQ** *f.* Fərəh gətirmək, şad etmək, sevindirmək, ürəyini açmaq. *Təzəcə biçilib, lay-lay yerə sərilmiş otun xoş ətri palıd ağaclarının kölgəsində oturanları daha da xoşhallandırırdı.* Ə.Əbülhəsən. *Ətrafdakı hər şey insanı xoşhallandırıb, könlünü açırdı.* M.Süleymanov.

**XOŞHALLANMA** "Xoşhallanmaq"dan *f.is.*

**XOŞHALLANMAQ** *f.* Kefi açılmaq, ürəyi açılmaq, şadlanmaq, sevinmək. *Rüstəm kişi .. səsi eşidib xoşhallandı.* M.İbrahimov. *Ay sağ ol, – deyə Yusif xoşhallandı.* B.Bayramov. *Cahandar ağanın paltarı islandı, kişi bundan daha da xoşhallandı.* İ.Şıxlı.

**XOŞHALLIQ** *is.* 1. Məmnunluq, sevinc, fərəh, ürəyi açılma.

2. **Xoşhallıqla** şəklində *zərf* – çox şad halda, razılıq, məmnunluq hissilə, məmnunluqla. *Saçları ağarmağa başlayan Cəmilə çox xoşhallıqla başını tərpətdi və gülümsədi.* S.Rəhimov. *..Yusifgil daha bir çox məsələlərdən danışıb razılığa gələndən sonra xoşhallıqla ayrıldılar.* B.Bayramov.

**XOŞXASİYYƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* xasiyyət] Xoş, yumşaq, mülayim, yaxşı xasiyyəti olan. *Xoşxasiyyət adam.* – [Fərman] *həm yaraşıqlı, həm bacarıqlı, həm də xoşxasiyyət adamdı.* M.İbrahimov. *O, mehriban, gülərüzlü; Xoşxasiyyət bir nənədir.* M.Dilbazi. *Ələddinin həyat yoldaşı Qızxanım da əri kimi xoşxasiyyət, üzügülər bir qadın idi.* H.Seyidbəyli.

**XOŞXASİYYƏTLİLİK** *is.* Xoşxasiyyət adamın təbiəti, xasiyyəti; yumşaqlıq, mülayimlik.

**XOŞXASSƏLİ** *sif.* [*fars.* xoş və *ər.* xassə] b a x **xətərsiz**.

**XOŞXATİR** *sif.* [*fars.* xoş və *ər.* xatir]: **xoşxatir olmaq** – xoşnud olmaq, məmnun olmaq, razı qalmaq, ürəkdən şad olmaq. [Axund:] *Sizə, şəxsən aşinalığım yox idisə də, xeyli əhsən demişəm, məmnun, xoşxatir olmuşam.* Mir Cəlal.

**XOŞXƏBƏR** [*fars.* xoş və *ər.* xəbər] b a x **xeyirxəbər**.

◊ **Xoşxəbər olasan! (olasınız!)** – b a x **xeyirxəbər olasan! (olasınız!)**. [Qumru:] *Xoşxəbər olasan, ay Sayalı xala!* Mir Cəlal.

**XOŞXƏT** *sif.* [*fars.* xoş və *ər.* xətt] Yaxşı, gözəl xətti olan.

**XOŞKƏLAM** *sif.* [*fars.* xoş və *ər.* kəlam] Şirindil(li), xoşsöhbət, dilişirin. *Əzziyəm, salam səni; Gördüm xoşkəlam səni. Əttar malı deyilsən; Pul tökəm, alam səni.* (Bayatı). *Göyçəkləri xoşkəlam, həm aşiqə ram; Vacibdi bizə duası Gürcüstanın.* S.Ə.Şirvani.

**XOŞQAMƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* qamət] Gözəl boy-buxunu, qədd-qaməti, sərrast bədəni olan; boy-buxunlu. *Əla, ey sərvi-xoşrəftar, xoşqamət, xudahafiz! Edər məşuqdən aşiq, budur adət, xudahafiz!* Q.Zakir.

**XOŞQƏDƏM(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* qədəm] Gəlişi ilə xoşbəxtlik gətirən, uğur gətirən; xeyirli, uğurlu; ayağıyüngül. *Başına döndüyüm qasid xoşqədəm; Ərzimi get söylə canana, gəlsin.* Aşıq Dilqəm. *Oğul! Deyirəm ki, nə xoşqədəmsən; Doğulduğun gündən ağ gündəyəm mən.* S.Rüstəm.

**XOŞQILIQ** *sif.* Xoşxasiyyətli, hamı ilə yola gedən, xoşrəftar. *Xoşqılıq adam.* – *Günəşüzlü, şirinsözlü, xoşqılıq; Ləblərindən axar balı gözəlin.* M.P.Vaqif. *Otuz beş yaşlarında, ortaboy, xoşqılıq, qəşəng görkəmli Sona qapıda göründü.* M.Süleymanov. *Ümid necə xoşqılıq; Ümid necə işvəkar; O – bütün qıfıllara; Düşən sirli bir açar.* B.Vahabzadə.

**XOŞQILIQLIQ** *is.* Xoşxasiyyətlilik, xoşrəftarlıq.

**XOŞLAMA** "Xoşlamaq"dan *f.is.*

**XOŞLAMAQ** *f.* Zövqünə uyğun gəldiyi üçün bəyənmək, xoşuna gəlmək, ürəyinə yatmaq. [Gülçöhrə:] *Bəs sən məni bir kərə görməklə xoşladın?* Ü.Hacıbəyov. [Murad] *Nigarı daha kiçik bir qız ikən xoşlamışdı.* S.Hüseyn. // Xoşu gəlmək, sevmək, istəmək. [Doktor Qəbzibəy:] *Siz hamınız bilirsiniz və görürsünüz ki, mən atı çox xoşlayanam.* C.Məmmədquluzadə. *Bayquş xaraba, gecəquşu qaranlıq sevən kimi, xain adamlar da xəlvəti xoşlarlar.* M.İbrahimov. *Balaca Kamal nənəsinin nağıllarını çox xoşlardı.* M.Rzaquluzadə.

**XOŞLANDIRMA** "Xoşlandırmaq"dan *f.is.*

**XOŞLANDIRMAQ** *f.* Xoş əhval-ruhiyyə yaratmaq, sevindirmək, fərəhləndirmək, ürəyini açmaq. [Altunbay Solmaza:] *Mən də səni daha artıq xoşlandırmaq üçün* [Elxanın] *füsunkar dilini dibindən kəsdirib atdıracağam.* C.Cabbarlı. // Məmnun və razı etmək, həzz vermək, ləzzət vermək.

**XOŞLANMA** "Xoşlanmaq"dan *f.is.*

**XOŞLANMAQ** *f.* Baxıb həzz almaq, ürəyi açılmaq, sevinmək, fərəh duymaq. *Qızın ala gözlərini, şümşad barmağını görən Kəblə Xeyransa xala çox xoşlanır.* H.Sarabski. *Qayınatasının son sözündən Zöhrə də xoşlanmışdı.* Ə.Vəliyev. // Xoşu gəlmək, məmnun olmaq, xoşnud olmaq, ürəyinə yatmaq. *O qədər xoşlanıram tüstüsü çıxcaq kababın; Ac pişik tək cumuram şövq ilə birbaşa ətə!* M.Ə.Sabir. [Əbülhəsənbəy:] *Səttar xanın bu söhbətdən xoşlanmadığını hiss etdim..* M.S.Ordubadi. *Bilikli şagirdlərdən; Müəllim çox xoşlanır.* M.Seyidzadə.

**XOŞLANMALI** *sif.* Sevinməli, fərəhlənməli, şadlanmalı; xoş, fərəhli. [Cahan:] *A balam, ağlamalı günlər keçdi, indi isə sevinməli, xoşlanmalı günlərimiz gəlibdir!* Ə.Haqverdiyev.

**XOŞLƏHCƏ** *sif.* [*fars.* xoş və *ər.* ləhcə] *klas.* b a x **xoşkəlam**. *Müdir Fəxrəddinə müraciət edib dedi: – Qurban olum, bu qızı danışdırın, çox xoşləhcə qızdır.* M.S.Ordubadi.

**XOŞLİQA** *sif.* [*fars.* xoş və *ər.* liqa] *klas.* b a x **xoşsurət(li)**. [Lətif şah:] *Pəridən xoşliqa, qılmandan əla; Məlayikdən gördüm lütfkar səni.* "Lətif şah". [Tülkü qarğaya:] *Nə gözəlsən, nə xoşliqasən sən; Yeri var söyləsəm: – hümasən sən.* M.Ə.Sabir.

**XOŞLUQ** *is.* 1. Xoşa gələn, ləzzət verən şeyin halı, xoş təsir. *Havanın xoşluğu.* – *Havada xəfif bir sazaq var idisə də, yazın ..*

*ilk yeli bu sazağa bir xoşluq verirdi.* Çəmənzəminli. *Aydınlığın xoşluğunda; Nə gözəlsən, sonam dəniz!* R.Rza. // Məlahət, gözəllik; gözə, qulağa gözəl təsir bağışlayan, ürəyəyatan. *Müğənninin səsinin xoşluğu.* // Xoş əhval-ruhiyyə, şənlik, fərəh. □ **Xoşluq gətirmək** – fərəh gətirmək, sevinc gətirmək. *Bəndalı həmişə evə gələndə bir şənlik, xoşluq gətirərdi.* Mir Cəlal.

2. **Xoşluqla** şəklində *zərf* – öz xoşu ilə, yaxşılıqla, öz razılığı ilə; qalmaqalsız, zorsuz. *Xoşluqla qəbul etmək.* – [Əsgər:] [Gülçöhrə] *xoşluq ilə ərə getməyə razı olmadı...* Ü.Hacıbəyov. [Müəllim:] *Siz də mövqeyinizi xoşluqla buraxmaq istəməyəcəksiniz.* S.Hüseyn. [General:] *Xoşluqla etməsə, nə gəlib zora? Biz ki gəlməmişik xoşluqla bura!* B.Vahabzadə.

◊ **Öz xoşluğu üçün** – özünə xoş olmaq üçün, öz səadəti üçün, öz xeyri üçün. *Öz xoşluğu üçün dünyalarca cinayətlərə səbəb olan bu adam, öz əməllərinin cəzasına çatdırılmışdı.* P.Makulu.

**XOŞMƏZAC** *sif.* [*fars.* xoş və *ər.* mizac] b a x **xoşxasiyyət(li)**. *Yüngül hərəkətli, xoşməzac Zəfərin görünüşü də xeyli dəyişmişdi, o arıqlamışdı.* M.Süleymanov.

**XOŞNƏVİS** *sif.* [*fars.*] *köhn.* Yaxşı xətti olan; xəttat.

**XOŞNİYYƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* niyyət] Niyyəti, məramı, məqsədi yaxşı olan; ürəyində kin, qərəz olmayan, ürəyitəmiz. *Novruzəli və usta Zeynallar daxilən çox təmiz və xoşniyyət adamlardır.* M.İbrahimov.

**XOŞNİYYƏTLİLİK** *is.* Xoş, gözəl niyyət, yaxşı məqsəd güdmə, yaxşılıq etmək niyyətində olma; ürəyitəmizlik.

**XOŞNUD** *sif.* və *zərf* [*fars.*] Razı, məmnun. *Sən pozmusan mənim xoşnud halımı; Abbas sana nə edib, tanrı zalımı?* "Abbas və Gülgəz". [Fərman:] *Bircə de görüm, əmim ağa ilə qohum olmaqdan xoşnuddurmu?* Ə.Haqverdiyev. [Araz və Günəş] *hər şeydə qənaətkar, hər zaman həyatlarından məmnun və xoşnud görünürlərdi.* A.Şaiq. [Şah:] *Sizi məşrutəçi cavanlar göndəriblər, mən də xoşnudam ki, məmləkətdə belə zəki cavanlar tapılır.* C.Cabbarlı. □ **Xoşnud etmək** – razı salmaq, məmnun etmək. *Keçmiş vaxtlarda teatr işlərimiz və teatr nümayişlərimiz məni o qədər məmnun və xoşnud eləməzdi, nə qədər ki indi eləyir.* C.Məmmədquluzadə. **Xoşnud olmaq** – razı düşmək, məmnun olmaq. *Məndən təki ol xatirin olsun xoşnud; Şadəm ki, salır fələk bu zindanə məni.* S.Ə.Şirvani. [Dərviş:] *Bu dəliqanlılar məni dərdimin üstündə doğrayıb itlərə atsaydılar, baxtımdan çox xoşnud olardım..* A.Divanbəyoğlu. [Rəşid:] *Anası xoşnud olur, zira nə qədər Qurbanquluya təklif etmişdisə də, rədd cavabı almışdı.* T.Ş.Simurq.

**XOŞNUDLUQ** *is.* Razılıq, məmnunluq; razı düşmə. *Xoşnudluğundadır nəcatım; Ey mənşəi-cövhəri-həyatım!* Füzuli. *Bir tərəfdən, sağ-salamat sahilə çıxmış olduqlarından doğan xoşnudluq, o biri tərəfdən, taleyi üçün məsul olduğu bölüyü tezliklə toplayaraq artıq limandan uzaqlaşan batalyonu təqib etmək lazım gəldiyi fikri leytenantı dərhal özünə gətirdi.* Ə.Əbülhəsən.

**XOŞNUDSUZLUQ** *is.* Narazılıq, məmnunsuzluq. *Qadın o saat dəyişildi, gözəl dodaqları büzüldü, qaşlar qalxdı, üzündə bir xoşnudsuzluq ifadəsi duyuldu.* Çəmənzəminli.

**XOŞRƏFTAR(LI)** *sif.* [*fars.*] Gözəl rəftarlı, adamlarla yaxşı rəftar edən; ünsiyyətli, mülayim. *Cavahir xanımdan aldığı həzz xanın çöhrəsində həkk olunmuş daimi qəzəb izlərini silib aparmış, onu xoşrəftar, mülayim bir süfrə sahibinə çevirmişdi.* Çəmənzəminli. *Fatma ağıllı, xoşrəftar bir arvad idi.* S.S.Axundov.

**XOŞRƏFTARLIQ** *is.* Xoşrəftar olma, rəftarı yaxşı olma; ünsiyyətlilik, rəftarda mülayimlik, münasibətdə xoşluq, yola getmə, ünsiyyət. *Bu* (*1862-ci il*) *polojeniyanın hökmüncə .. hər iki sinfin* (*rəiyyətin və ağaların*) *mabeynində guya bir növ sülh və xoşrəftarlıq binası təsis olundu.* F.Köçərli.

**XOŞRƏNG(Lİ)** *sif.* [*fars.*] Xoşagələn rəngi olan, rəngi xoş olan. *Xoşrəng parça. Xoşrəng üz.* – *Hava gözəl olduğundan Gülzarın yanaqları daha da xoşrəng olub duru-al bir rəng almışdı.* C.Cabbarlı. *Dilbərin zülfi şəbi-yelda, cəmali çilçıraq; Ləbləri xoşrəng, vəsli abidar olsun gərək.* M.Möcüz.

**XOŞSƏS(Lİ)** b a x **xoşavaz(lı)**.

**XOŞSƏSLİLİK** bax **xoşavazlıq**.

**XOŞSİFƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* sifət] 1. Gözəl, göyçək, xoşsima, qanışirin. *Abbas uzunboylu, nazikbədən, ağbənizli, alagözlü, xoşsifət bir uşaq idi.* S.S.Axundov. *Mən geri çəkilib, bu xoşsifət qadına müdirin stoluna yaxın durmaq üçün yol verdim.* T.Ş.Simurq.

2. *məc.* Gülərüzlü, xoşrəftar, nəvazişkar; xeyirxah, səmimi. *Koroğlu baxdı ki, nalbənd çox xoşsifət bir kişidir.* "Koroğlu". *Fərmanı sözün tam mənasında gülərüz və xoşsifət adlandırmaq olardı.* Ə.Sadıq. *Aslan bu xoşsifət adamları lap ilk gündən sevməyə başladı.* S.Vəliyev.

**XOŞSİFƏTLİK** *is.* 1. Xoşsifət adamın halı.

2. *məc.* Üzügülərlik, xoşrəftarlıq, mehribanlıq, nəvazişkarlıq, iltifat. *Otağın rahat və uyğunluğundan, qulluqçunun safdil və gözəlliyindən başqa, student üçün bir ayrı məsələ də var: bu da xanımın xoşsifətliyidir.* Çəmənzəminli.

**XOŞSİMA(LI)** *sif.* [*fars.* xoş və *ər.* sima] Siması (üzü) xoşa gələn; xoşgörkəm, göyçək, qanışirin. [Əmi] *ucaboy, gərdənli, qarasaqqal, xoşsima bir kişi idi.* N.Nərimanov. *Nəriman böyüdükcə gözəllənib uca boylu, xoşsima, mövzun qədli bir oğlan olmuşdu.* Ə.Haqverdiyev.

**XOŞSÖHBƏT** *sif.* [*fars.* xoş və *ər.* söhbət] Yaxşı müsahib, söhbətcil, söhbətindən ləzzət duyulan. *Badisəba xanımın çox xoşsöhbət və zarafatcıl olduğu meydana çıxdı.* Çəmənzəminli. [Hüsaməddin:] *Əxi Fərrux o qədər sevimli və xoş əqidə, xoşsöhbət bir adamdır ki, mən onunla görüşdüyümün birinci saatında Gəncə ruhanilərindən gördüyüm təhqirləri tamamilə unutdum.* M.S.Ordubadi.

**XOŞSURƏT(Lİ)** bax **xoşsima(lı)**.

**XOŞTALE** *sif.* [*fars.* xoş və *ər.* tale] Bəxtli, qismətli, bəxti üzdə olan; uğurlu. *Xoştale imişsən ki, bu gün feyzi-hüzurum oldu sənə qismət.* M.Ə.Sabir.

**XOŞTƏB** *sif.* [*fars.* xoş və *ər.* təb] Yaxşı təbi olan, istedadlı. *..Bizim də çox böyük, müqtədir və xoştəb milli şairlərimiz olubdur.* F.Köçərli.

**XOŞTƏBİƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* təbiət] Yaxşı xasiyyətli, gözəl təbiətli, xoşqılıqlı. *Hamı müsəlmanlar sənin kimi xoştəbiət ola idilər.* Ü.Hacıbəyov. *..Dürdanə xanım xoştəbiətli, sadə ürəkli, nazik, bir qədər mövhumatçı bir adamdı.* Ə.Əbülhəsən.

**XOŞTİNƏT(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* tinət] *klas.* bax **xoştəbiət(li)**. *Dedi kim, şəxs olsa xoştinət; Yaxşılıqdan müdam edər söhbət.* S.Ə.Şirvani.

**XOŞÜZ(LÜ)** 1. Bax **xoşsima(lı)**. *Gecə boylu bir qadındır ağrı çəkərək; Xoşüzlü bir uşaq kimi doğur səhəri.* S.Vurğun.

2. **Xoşüzlə** şəklində *zərf* – gülər üzlə, mehribancasına, nəvazişlə. *Qonağı xoşüzlə qarşılamaq. Əsgərləri xoşüzlə qarşılamaq. – Zəfər baş geoloqu xoşüzlə qarşılayıb uzaqdan gülə-gülə sözə başladı..* M.Süleymanov.

**XOŞZAHİR(Lİ)** *sif.* [*fars.* xoş və *ər.* zahir] Xarici görünüşü gözəl, xoşa gələn, üzdən yaxşı. *Xalq məhkəməsinin katibi çolaq Mirzə Mustafa xoşzahir, bədbatin bir adam idi.* E.Sultanov. *Xoşzahir, bədbatin, vicdansız, alçaq; Necə qıydın, mənə ağlağan dedin?* Aşıq Hüseyn.

**XOTKAR** *is. tar.* Hökmdar, başçı. *Hər cümə günündən cümə gününə xotkar qızı Nigar xanım məscidə gedir.* "Koroğlu". *İbrət et Ağaməhəmməd xandan, ey kəmtər gəda; Ta həyatın var ikən, nə şahə, nə xotkarə bax!* M.P.Vaqif. *Nə qızdan başlamısan? Guya bir xotkarın qızıdır!* S.Rəhimov.

**XOTKƏ** bax **cürə**$^{3}$.

**XOTUQ** *is.* Eşşək balası, qoduq.

**XOV** *is.* Bəzi parçaların, xalça və s. üzərində incə tükcüklər.

**XOVLAMA** "Xovlamaq"dan *f.is.*

**XOVLAMAQ** *f.* İpin, sapın xovunu təmizləmək.

**XOVLU** *sif.* Xovu olan, üstü xovla örtülü. *Xovlu xalça. Xovlu parça. Xovlu dəsmal. – Xovlu fərməş bir neçə yerdən didilibyeyilmişdi, elə bil güvənin ağzından çıxmışdı, amma hələ rəngini itirməmişdi.* İ.Məlikzadə.

**XOVSUZ** *sif.* Xovu olmayan. *Xovsuz xalçalar qrupuna palaz, kilim, sumaq, cecim, vərni, şəddə, zili daxildir. – Hazırda ən zəngin xovlu və xovsuz xalçalar və xalça məmulatı kolleksiyası Dövlət muzeyindədir.*

**XOY** *is.* [*fars.*] Xasiyyət, təbiət, xilqət. *Atı at yanında bağlarsan, həmrəng olmasa*

*da, həm xoy olar.* (Ata. sözü). [Koroğlu:] *Bir xələt biçərəm Eyvaz boyuna; İncimərəm xasiyyəti-xoyundan.* "Koroğlu". *Əl işin, gül naxışın; Xoyun, xasiyyətin gözəl.* Aşıq Ələsgər.

**XOYLANDIRMA** "Xoylandırmaq"dan *f.is.*

**XOYLANDIRMAQ** *f.* Xoylanmasına səbəb olmaq, şübhələndirmək.

**XOYLANMA** "Xoylanmaq"dan *f.is.*

**XOYLANMAQ** *f.* Şübhələnmək, şəkkə düşmək. [Dərviş:] *Qoca kişi əvvəlkindən indi diqqət ilə mənə baxıb məndən xoylanan kimi oldu..* A.Divanbəyoğlu.

**XOZEYİN** [*rus.*] Sahib, sahibkar, ağa. [Xəlil:] *Salaməleyküm, xozeyinim buraya gəlməyib?* N.Vəzirov. [Bir qrup fəhlə:] *Lap günü sabah xozeyin özü donluğumuzu artıracaq.* M.Hüseyn.

**XÖRƏK** *is.* Bişirilib yeyilən şey, yemək, bişmiş. *Ət xörəyi. Xəmir xörəyi. Xörək hazırlamaq. – Xörəyin yeyilməyi iki saat çəkdi...* C.Məmmədquluzadə. *Hacı Səmədin xörəyin üstündən çay içmək adəti idi.* S.S.Axundov. *Xarisə qızardılmış qiymədən hazırlanırdı və bütün cah-cəlallı toy məclislərinin süfrəsində birinci və ən vacib bir xörək idi...* Ə.Məmmədxanlı. // Plov, aş. *Qərənfil xala eyvanın buxarısında qaynayan balaca qazanın ağzını açdı, xörəyin dəmini aldı.* Ə.Vəliyev.

◊ **...xörəyi deyil** – bacarmaz, ...işi deyil, qabiliyyəti, gücü çatmaz. *Məcidin bel tutmağından, dairə boyu gəzişə-gəzişə beli eyni xəttə tez-tez vurmağından Umud başa düşdü ki, kənkanlıq hər adamın xörəyi deyil.* İ.Məlikzadə.

**XÖRƏKBİŞİRƏN** *is.* Aşpaz. *Toya xörəkbişirən dəvət edilib.*

**XÖRƏKLİK** *is.* Xörəyə məxsus keyfiyyət. [İlham:] *Şofer maşını qovsa, xörəkdə xörəklik qalmaz, axı!* C.Gözəlov.

**XÖRƏKPAYLAYAN** *is.* Gələnlərə yemək gətirən aşxana işçisi. *Umud xörəkpaylayan caydaq oğlana əl elədi*. İ.Məlikzadə.

**XÖTƏK** *is.* Camış balası, balaq. *Yetər xötək və buzovları bağlayırdı ki, qaçıb analarını əmməsinlər.* Qantəmir. *Qoyun, quzu, dana, xötək; Mal-qara da dolur dama.* B.Vahabzadə.

**XRİSTİAN** [*yun.*] 1. Xristian dininə mənsub adam, xaçpərəst. [Altun bay:] *Sən də, Toğrul, xristian hərif, yaxın gəl..* C.Cabbarlı.

2. *Sif. mənasında.* Xristian dini. *Xristian kilsəsi. Xristian əhali. – Ətrafı sərvlərlə əhatə olunmuş bir xristian məzarlığı, səhnənin ucunda məzarçıya məxsus bir oda.* H.Cavid.

**XRİSTİANLAŞDIRILMA** "Xristianlaşdırılmaq"dan *f.is.*

**XRİSTİANLAŞDIRILMAQ** *məch.* Xristian dini qəbul etdirilmək.

**XRİSTİANLAŞDIRILMIŞ** *f.sif.* Xristian dini qəbul etdirilmiş, xaçpərəst edilmiş.

**XRİSTİANLAŞDIRMA** "Xristianlaşdırmaq"dan *f.is.*

**XRİSTİANLAŞDIRMAQ** *f.* Hər hansı bir yerdə xristianlığı yaymaq, xristian olmayan xalqları xristian etmək, xaçpərəstliyi qəbul etdirmək.

**XRİSTİANLAŞMA** "Xristianlaşmaq"dan *f.is.*

**XRİSTİANLAŞMAQ** *f.* Xristian dinini, adət və ənənələrini, mədəniyyətini qəbul etmək, dönüb xristian (xaçpərəst) olmaq.

**XRİSTİANLAŞMIŞ** *f.sif.* Xristian dininin tələblərinə və ənənələrinə uyğunlaşmış, dönüb xristian (xaçpərəst) olmuş.

**XRİSTİANLIQ** *is.* 1. Eramızın birinci əsrində meydana gəlmiş din (bu din yerə enmiş və insanların nicatı üçün bütün əzab və əziyyətləri üzərinə götürmüş insan – İsaya inam əsasında qurulmuşdur); xaçpərəstlik. // Bu dinə mənsubluq.

2. *top.* Xristianlar.

**XRİZANTÉM** [*yun.*] Mürəkkəbçiçəklilər fəsiləsindən müxtəlif rəngdə çiçəkləri olan bəzək bitkisi; payızgülü. *..Qəzetlərə sarılmış qərənfil və xrizantem dəstələri açılıb hazırlandı.* M.S.Ordubadi. [Lətifə] *.. çiçək mağazasına getmiş, diqqətlə seçdiyi qərənfildən, ulduz çiçəklərindən, xrizantemdən bir dəstə bağlatmışdı.* M.Hüseyn.

**XROM** [*yun.* chroma – rəng] 1. Kimyəvi element; açıq-boz rəngli bərk metal (metal məmulatın üstünü örtmək üçün bərk ərinti). *Xromdan metallurgiyada paslanmayan polad, ferrixrom* (*dəmirlə xromun xəlitəsidir*) *hazırlanır.* M.Qaşqay.

2. Həmin metalın duzlarında aşılanmış yumşaq, nazik dəri və bu dəridən hazırlanmış. [Nağı:] *Usta, sənə bir xrom sapoq mənim boynuma.* "Aşıq Ələsgər". [Qədirin] *əynində sürməyi parçadan köynək və şalvar, ayaqlarında yumşaq xromdan uzunboğaz çəkmə vardı.* İ.Əfəndiyev.

3. Xrom turşusu duzlarından alınan sarı boya.

**XROMATİK** *sif.* 1. Xromatizm (1-ci mənada) hadisəsinə əsaslanan. *Şüanın xromatik ayrılması.*

*2. mus.* Xromatizmə (2-ci mənada) əsaslanan, xromatizm nəticəsində əmələ gələn. *Xromatik interval. Xromatik yarımton. – Yeddi əsas Azərbaycan ladının 12 pərdəli xromatik qammanın hər bir tonunda qurulması da 84 rəqəmini əmələ gətirir.* Ü.Hacıbəyov.

**XROMATİZM** [*yun.* chroma (chromatos) – rəng] 1. *fiz.* Ağ şüanın müxtəlif rəngli şüalara ayrılma xassəsi.

2. *mus.* Səsin yarımtonlar üzrə qalxması və ya enməsi. *Səsləri zilləşdirən və ya bəmləşdirən işarələrə xromatizm və ya alterasiya işarələri deyilir.* "İbtidai musiqi nəzəriyyəsi".

**XROMLAMA** "Xromlamaq"dan *f.is.*

**XROMLAMAQ** *f.* 1. Möhkəmlik, davamlılıq və ya yaraşıq vermək üçün metal əşyanın üzərinə xrom çəkmək. *Maşın hissələrini xromlamaq.*

2. Xrom duzları ilə işləmək.

**XROMLU** *sif. kim. tex.* Xrom (1-ci mənada) qarışığı olan, tərkibində xrom olan. *Xromlu boyalar. Xromlu polad.*

**XROMOSÓM(LAR)** [*yun.* chroma – rəng və *soma* – cisim] *biol.* Heyvan və bitki orqanizmlərinin hüceyrə nüvələrində olan və müvafiq surətdə boyadıldıqda aydın surətdə gözə görünən cisimciklər (xromosomlar hüceyrə nüvəsinin lazımi və daimi tərkib hissələridir, hüceyrənin maddələr mübadiləsində və orqanizmlərin əlamət və xassələrinin bir nəsildən başqa nəslə irsən keçməsində fəal iştirak edirlər).

**XROMOSFER** [*yun.* chroma – rəng və spaira – kürə, şar] *astr.* Günəş tutulan zaman, onun ətrafında qırmızı haşiyə kimi görünən Günəş atmosferi təbəqələrindən biri.

**XRONÍK** *sif.* [*yunancadan*] Uzunsürən, çox davam edən; daimi. *Xronik xəstəlik. – Qulağın otit adlanan irinli xəstəliyi çox müxtəlif müalicə üsulları ilə müalicə edilməsinə baxmayaraq, çox vaxt nəticəsiz qalıb xronik hala keçir.* H.Tağıyev.

**XRÓNİKA** [*yun.* chronikos – vaxt] 1. B a x **salnamə**.

2. Siyasi, ictimai və ya ailə hadisələrinin tarixini ardıcıl surətdə təsvir edən rəvayət və ya dramatik əsər.

3. Qəzetdə, jurnalda yerli xəbərlər şöbəsi. *Məhkəmə xronikası.* // Kinoda: gündəlik ictimai həyata həsr edilmiş şəkil.

**XRONİKAÇI** *is.* Qəzet, jurnal, radio-televiziya üçün yerli xəbər və materiallar toplayan qəzet və s. işçisi; müxbir.

**XRONİKAL** [*yunancadan*] Xronika mahiyyətində olan, xronikadan ibarət olan.

**XRONİKÍ** b a x **xronik**. *Spirtli içkilərin müntəzəm içilməsi alkoqolizm kimi xroniki xəstəliyə gətirib çıxarır.*

**XRONOLÓGİYA** [*yun.* chronikos – vaxt və logos] Tarixi ardıcıllıq. ["Hophopnamə"] *1934-cü il çapından fərqli olaraq, bu nəşrdə xronologiya əsas alınmış, əsərlər janrına və yazılma tarixinə görə qruplaşdırılmış, hər fəslin axırında isə "illəri məlum olmayan" əsərlər verilmişdir.* M.Məmmədov.

**XRONÓMETR** [*yun.* chronos – vaxt və metreo – ölçürəm] Astronomların, geodeziyaçıların, dənizçilərin işlətdiyi xüsusi dəqiq saat növü.

**XRONOMETRÁJ** [*yun.* chronos – vaxt və metreo – ölçürəm] Əmək prosesləri müddətinin saniyəölçən vasitəsilə dəqiq ölçülməsi (müəssisələrdə, istehsalatda əməyin normalaşdırılmasında tətbiq olunur).

**XRONOMETRAJÇI** Xronometraj aparan şəxs.

**XRONOMETRAJLAMA** "Xronometrajlamaq"dan *f.is.*

**XRONOMETRAJLAMAQ** *f.* Xronometraj vasitəsilə ölçmək.

**XRONOSKÓP** [*yun.* chronos – vaxt və skopeo – baxıram] Son dərəcə qısa (saniyənin mində birinə qədər) vaxtları ölçmək üçün elektrik saatı.

**XU** *is.* [*fars.*] *klas.* b a x **xoy**. *Çox gözəlsən, amma xuyundur yaman; Baxmazsan üzümə mənim çox zaman.* M.P.Vaqif. *Duzlu hekayətin, nəmaki sözün; Pəsəndidə xülqü xuyun istərəm.* Q.Zakir.

**XUB** *sif.* və *zərf* [*fars.*] *klas.* 1. Yaxşı, gözəl, xoş. *Gümüş kəmər xub yaraşır belinə; Yaxası qızıldan düymələnibdi.* Aşıq Ələsgər. // Yaxşıca, bərk, əməlli-başlı. *Xub yeyib-içdilər. Xub əzişdirdilər.*

2. *is. məc.* Gözəl, dilbər. [Qərib:] *Bir əl vurun, xublar girsin oyuna; Mən qurbanam qamətinə, boyuna.* "Aşıq Qərib". *Vaqif səni sevdi xublar içində; Bir taza qonçasan gülzar içində.* M.P.Vaqif.

3. "Yaxşı", "razıyam" mənasında (razılıq bildirir). [Miraxur:] *Xub, Şah Abbas o vaqtdə padşah idi. Hökmü bizə rəvan idi.* M.F.Axundzadə.

**XUBLUQ** *is. klas.* Gözəllik, göyçəklik. [Kərəm:] *Camalın xubluğu mat elər şahı; Göylərə dayanır aşığın ahı.* "Əsli və Kərəm". *Əl işin, gül naxışın; Xoyun, xasiyyətin gözəl; Xubluğun, yaraşığın; Aldığın baratın gözəl.* Aşıq Ələsgər. *Nə gözəl çəkilib qəddü qaməti; Xubluğu mahala car, bizə gəldi.* Aşıq Hüseyn.

**XUBRU** *sif.* [*fars.*] *klas.* Gözəlüzlü, göyçək, qəşəng, xoşbəniz. [Hərəmlərin] *cümləsindən iki nəfər dilbəri-xubru ki, xilafirizaları ilə şahın hərəmxanəsinə düşmüşdülər, qayət şərm ilə və ahəstə səslə ərz etdilər..* M.F.Axundzadə. *Nə kami-dil verər; nə könül yanar; Məgər xubrular savab istəməz?* Q.Zakir.

**XUDA** *is.* [*fars.*] 1. Allah, Tanrı. *Bəlalərdən səni saxlasın xuda; Sən tək gözəl, əldən olmasın cida.* M.P.Vaqif. *Ey xuda, kim çəkər axırda gülabın bu gülün; Dərdi-sər dəfinə aləmdə bu dərman gülüdür.* S.Ə.Şirvani. [Sitarə:] *Xuda bilir ki, səni qəlb-safidən sevirəm.* C.Cabbarlı.

2. **Xudaya** şəklində *nida* – ay Allah, ilahi (Allaha xitab, müraciət, yalvarış). [Kərbəlayı Qədim:] *Xudaya, cəlalına şükür. İndi sənə inanmayanlar sənin qüdrətini öz gözləri ilə gördülər.* Ə.Haqverdiyev. [Ana:] *Onu jandarmalar gəzir dörd gözlə; Xudaya! Qəribdir, sən onu gözlə!* S.Vurğun. "*Şükür sənə, xudaya, hələ ki birtəhər süyüşdük*" – *deyə* [Əlləzoğlu] *pıçıldadı.* İ.Huseynov.

**XUDAHAFİZ** *nida* [*fars.* xuda və *ər.* hafiz] "Allah hifz eləsin", "Tanrı saxlasın" mənasında vidalaşıb ayrılanda deyilir – sağ ol! sağ olun! [Şah:] *Dəxi məni axtarmayın ki, görə bilməzsiniz! Xudahafiz! – deyib, taxtdan düşüb hərəmxanəyə rəvanə oldu.* M.F.Axundzadə. *Bizim bəzi boşboğaz yazıçılarımız da oxşuyurlar haman təbiblərə ki, azarlının nəbzinə baxandan sonra, "xudahafiz" deyib börklərini axtarırlar.* C.Məmmədquluzadə. [Əsgər:] *Rüstəm bəy, xudahafiz! Məşədi İbad, xudahafiz!* Ü.Hacıbəyov. – *Onda xudahafiz, – deyə kişi qəzəblə donquldanıb yenə getdi.* H.Seyidbəyli. ◻ **Xudahafiz eləmək** – b a x **xudahafizləşmək**. *Plovdan sonra durdum, xudahafiz elədim...* Ə.Haqverdiyev. *Teleqrafçı xudahafiz edib getdi.* T.Ş.Simurq.

**XUDAHAFİZLƏŞMƏ** "Xudahafizləşmək"dən *f.is.*

**XUDAHAFİZLƏŞMƏK** *f.* Xudahafiz (sağ ol) deyib biri-birindən ayrılmaq, sağollaşmaq. [İmran kişi:] *Bir az da İsmayıllını dinləyəndən sonra xudahafizləşib, trubkanı yerindən asdı.* M.Hüseyn. *Aydın başı ilə xudahafizləşib qapıya tərəf getdi.* H.Seyidbəyli. *Dilbər utana-utana mühəndislə xudahafizləşib, təpəyə qalxmağa başladı.* Ə.Sadıq.

**XUDANƏKƏRDƏ** [*fars.*] "Allah eləməsin", "iraq olsun" mənasında qorxulu, zərərli bir şey, hadisə haqqında deyilir. [Sultan bəy:] *..Dedim gedim görüm, bəlkə qız, xudanəkərdə, özünə bir xəsər-zad yetirdi.* Ü.Hacıbəyov. [Axund:] *Neçə gündür, deyirdim ki, ay kişi, nə olubdur ki, Səfər bəy axır zaman heç görünmür, xudanəkərdə, görəsən, bur xəta üz verməyib ki.* B.Talıblı. [Dükandarlardan biri:] *Elə xəlvətdə, xudanəkərdə, bəlkə də bir iş elədi* [Səttar], *bu işlərə xan özü əncam çəkməlidir.* P.Makulu.

**XUDAVƏND** *is.* [*fars.*] *klas.* 1. Allah, Tanrı. [Molla Qurban Fərruxa:] *Xudavənd təbarək və təala ruzini həmişə artıq eləsin, inşallah.* Ə.Vəliyev. ◻ **Xudavəndi-aləm** (Allahın vəsflərindən biri, dünyanın sahibi, ağası) – Allah. *Bu surətdə nə səbəbə xudavəndi-aləm özünün kitabını gətirən-*

*lərin dinlərindən bir neçə min il əvvəl belə cürbəcür batil dinlərin meydana çıxmasına razı olmuşdur.* M.F.Axundzadə. [Sığırçı:] *İndi, əmi, get, bax gör xudavəndi-aləm nə cür gözəllər yaradıb.* "Aşıq Ələsgər".

2. **Xudavənda** (bəzən **xudaya-xudavənda**) şəklində *nida* – ay Allah! ey Tanrı! (Allaha xitab). *Fələk qoymaz ki, ol mahə verim mən canımı bir gün; Xudavənda, bilirsən kim, deyildir himmətim naqis.* S.Ə.Şirvani. [Xırda xanım:] *Xudavənda, görəsən mənim kimi də dünyada bir bədbəxt varmı?* N.Vəzirov. [Mərsiyəxan:] *Xudaya-xudavənda! Bu nazənin sənəm huriyi-rizvanmı?* Çəmənzəminli.

**XUDBİN** *sif.* [*fars.*] Ancaq özünü düşünən, öz mənafeyini hər şeydən yüksək tutan adam; eqoist. *Müəllim əvvəldə molla Xəlil ilə mübahisəyə girişmək istəməyirdi, onu xudbin bir adam tanıyırdı.* S.Hüseyn. *Çox savadlı və çox bilikli, şöhrətpərəst, xudbin, hakimiyyət sevən oğrunun, həris və yalançının öhdəsindən gəlmək çox çətindir.* M.İbrahimov. *Bütün istedadsız və xudbin adamlar kimi Kərəmov da paxıl və xəbisdir.* İ.Əfəndiyev.

**XUDBİNLİK** *is.* Ancaq özünü düşünmə, özünü istəmə, öz mənafeyini hamıdan yüksək tutma; eqoistlik. *Vay cəhalət, vay xudbinlik, siz neçə-neçə müsibətlərə baissiniz?* N.Vəzirov. [Cəfər Rüstəmbəyə:] *Qardaş, hər kəsin əlinə nə düşdü, gərək xudbinliyi kənara qoyub, yoldaşını da yada salsın..* Çəmənzəminli. *Gülnaz lovğa bir xudbinliyi ifadə edən bu sözlərdən tutulub sıxıldı.* Q.İlkin.

**XUDMANİ** *sif.* və *zərf* [*fars.*] 1. Gizli, dostyana, məhrəmanə, məhrəmanə bir şəraitdə başqalarının olmadığı bir şəraitdə. *Xudmani söhbət. Xudmani danışıq. – Bəli, mən istəyirəm söhbətimiz xudmani olsun, – deyə, Müqim bəy yan-yörəsinə baxdı.* S.Rəhimov.

2. Ancaq ən yaxın, ən inanılmış adamlardan ibarət. [Qəhrəman:] *..Xudmani bir məclis düzəldərəm.* S.Rəhimov. *Fevral ayının 12-də Ağa Mirsadıq ağa ikisini də axşam yeməyinə dəvət etdi. Bu çox "xudmani" bir qonaqlıq idi. Bir ev sahibi, iki də qonaq – vəssalam.* Qantəmir. // Xəlvəti. [Firidun] *xudmani bir bağı və həyəti olan yaxşı bir adama rast gəldi.* M.İbrahimov.

3. Bir ailəyə məxsus, kiçik. *Karvansaranın hətta xüsusi çalğıçıları və nəğməçi cariyələri vardı ki, bu və ya digər hücrədə xudmani eyş-işrət məclisi qurulanda nəğməçi cariyələr o məclislərə ruh verir, əvəzində maddi nemətlər kəsb edirdilər.* Ə.Məmmədxanlı.

**XUDPƏSƏND** *sif.* [*fars.*] Özünü çox bəyənən, özündən çox razı; lovğa, xudbin. *Qənbərin bu sözləri məğrur və xudpəsənd Varisdə böyük bir maraq oyatdı.* A.Şaiq. *Xudpəsənd xan bir zamanlar həmin bəylər, əyanlar qarşısında məğlubiyyətə düçar olduğunu hələ də həzm edə bilməmişdi.* Ə.Məmmədxanlı. // İs. mənasında. *Öz halını düşünmə tez, xalqın üçün külüng vur; Qeyrətsizi, xudpəsəndi tarix haqlı unudur.* S.Vurğun. [Aydın:] *Xudpəsənd öz canının dərdinə qalıbmış.* H.Seyidbəyli.

**XUDPƏSƏNDLİK** *is.* Özünü çox bəyənmə, özündən çox razı qalma; xudbinlik, lovğalıq. [İkinci mühəndis:] *..Mən özüm də nadan bir şəxs olduğumdan* [Yaqubun] *xudpəsəndliyinə etiraz etməyib, dediklərini bir məlumat olaraq qəbul eləyirdim.* B.Talıblı. *Öz xudpəsəndlik mərəzi ilə yaşayıb, gözü yan-yörəsini seçməyən Kamilov indi özünü təklənən gördü.* S.Rəhimov. [Tahirin] *fikrincə hər addımda xudpəsəndliyə qapılmaq, .. narazılıq eləmək faydasız bir işdi.* M.Hüseyn.

**XUL, XULBALIĞI** *is. zool.* Əsasən dənizdə yaşayan xırda balıq növü.

**XULİQÁN** [*ing.* adam adından] Xuliqanlıq edən adam. *Nədən qalxışdı xulqanlar; Satıldı pula imanlar; Töküldü bigünah qanlar.* M.Ə.Sabir. *Qıza sataşmaq istəmişdilər, çığırıb xuliqanların əlindən qaçmışdı.* H.Seyidbəyli. *Gər deyən olsa ki, xuliqandı bu; İnanmarıq biz ona, böhtandı bu; Gör necə bir modabaz oğlandı bu.* Ə.Vahid.

**XULİQANLIQ** *is.* İctimai qayda-qanunu, ümumi nizam-intizamı, əxlaq normalarını pozma hərəkətləri, cəmiyyətə hörmət etməmə; dələduzluq. *Xuliqanlıqla mübarizə.* – [Cəmilə], *özilə həyat yoldaşı olacaq bir adamın klub kimi ictimai bir yerdə cəncəl*

*çıxarıb xuliqanlıq yapmasına bir məna verə bilməyirdi.* S.Hüseyn.

**XUMAR** *sif.* [*ər.*] 1. Süzgün (göz, baxış haqqında). *Nə baxırsan pəncərədən; Xumar gözün süzən gözəl?!* Aşıq Ələsgər. *Qız isə Bahadırı görüb yanından keçərkən, xumar gözlərini Bahadıra süzdürdü.* N.Nərimanov. *Yüzillik bir ömrü qurban verərdim; Xumar gözlərinə baxsaydım bir an.* R.Rza.

2. Keflilik, məstlik. *Xanın bu nərəsinə xumardan sərasimə ayılan qaçaqlar dəhşətdən yerlərində donub qaldılar.* M.Rzaquluzadə. ☐ **Xumar olmaq** – keflənmək, məst olmaq, nəşələnmək. *Gecə və gündüz məst xumar olan xəlifə, Əmin ağamın ona göndərdiyi həcvi oxuyub üç gün üç gecə yasa batmışdı.* Ə.Məmmədxanlı.

**XUMARGÖZ(LÜ)** *sif.* Gözləri xumar, süzgün olan; süzgünbaxışlı. *Xumargözlü qız.* – *Qara at nalı neylər; Qara göz xalı neylər; Ağlama, xumargözlü balam; Görək, ilahı neylər.* (Bayatı).

**XUMAR-XUMAR** *zərf* Süzgün-süzgün, nazlı-nazlı. *Xumar-xumar baxmaq göz qaydasıdır; Lalətək qızarmaq üz qaydasıdır.* M.P.Vaqif. *Xumar-xumar o baxmağı gözlərin; Yağmalayıb solu-sağı gözlərin.* Q.Zakir. *Kim bilir, o xumar-xumar baxışın nə qədər ruha saplanıb qalmış.* A.Şaiq.

**XUMARLANDIRMA** "Xumarlandırmaq"dan *f.is.*

**XUMARLANDIRMAQ** *f.* Xumar etmək, məst etmək, bihuş etmək, keflәndirmək. *Günorta yerindən əyilmiş qızmar günəş akasiya salxımlarını, qızılgül yarpaqlarını pörtür, havanı bu çiçəklərin adamı xumarlandıran* (f.sif.) *tünd ətri ilə doldururdu.* Ə.Əbülhəsən.

**XUMARLANMA** "Xumarlanmaq"dan *f.is.*

**XUMARLANMAQ** *f.* 1. Keflənmək, nəşələnmək, məst olmaq. // Keflilikdən axmaq, süzülmək (göz haqqında). *Gülnaz kabab gətirdi. Süfrəyə qoyub qayıtmaq istədi. Mübaşir Məmməd xumarlanan gözlərini onun ala gözlərinə dikdi.* M.İbrahimov. *Yalan sərxoşluğunda elə xumarlanmışıq; Çaylağı yol, gülü kol, qaranı ağ sanmışıq.* B.Vahabzadə.

2. Nəşələnmək, zövqlənmək, zövq almaq, nazlanmaq. [Yaşlı kişi:] *Uzandığım krovatda xumarlanırdım.* S.Hüseyn. *Bu dadlı laylalardan balaca* [qız] *xumarlanıb şirin yuxuya getdi.* S.S.Axundov. [Tahir] *adəti üzrə, yorğan-döşəkdə xumarlanmadan tez qalxıb paltarını geyindi.* M.Hüseyn. // Məc. mənada. *Qışın səhərində bu qarlar düzü; Günəşdən qızınıb xumarlanırdı.* S.Vurğun. *Rüstəm kişi atın belinə sıçrayıb dala baxmadan günəş işığı altında xumarlanan çöllərə tərəf sürdü.* M.İbrahimov. *..Nazlanıb xumarlanan çay hamının üzünə gülümsəyirdi.* S.Vəliyev.

**XUMARLIQ** *is.* Məstlik, keflilik; kefli (məst) adamın haləti. *Xumarlıq aləmində seyr edən tiryəkilərdən bir neçəsi yatağan ilan kimi gözlərini zorla açırdı.* P.Makulu. *Gözlərinin xumarı pozdu xumarlığımı; Xumarlığın nəğməsi təranən idi sənin.* Şəhriyar.

**XUNXAR** *sif.* [*fars.*] Qaniçən, zalım, cəllad, qandan doymayan; yırtıcı. *Xunxar olan əfradi-bəni-növ'ünə daim; Bu vəhşiyü ğürranlarına şükr, xudaya!* M.Ə.Sabir. *Sən yazırsan mənə, ay molla ki, əşar yazım; Mülkədarı, bəyi və xanları xunxar yazım?* Ə.Nəzmi. // *Məc. mənada.* Gözələ işarə. *Neyləmişəm o xunxara; Müttəsil baxar əğyarə; Bir dəm eyləməz nəzzarə; Məni-rüsvaya gözlərin.* Q.Zakir.

**XUNXARLIQ** *is.* Qaniçicilik, zalımlıq, cəlladlıq, rəhmsizlik, vəhşilik, yırtıcılıq. [Cəmil bəy:] *Əcəba insanlarda bu cəlladlıq, bu xunxarlıq nə vaxta qədər davam edəcək!* H.Cavid.

**XUNTÁ** [*isp.* junta – toplanma, birləşmə] İspaniyada və Latın Amerikası ölkələrinin çoxunda ictimai-siyasi təşkilat və birləşmələrin adı; hərbi çevriliş nəticəsində hökumət başına keçən hərbçilər dəstəsi. *Yasaq olan bir ölkədə; Qatı zülmət işıqlıqda; nur kölgədə... Buna dözmək? Necə dözmək? Xunta qeyri-qanunidir; Əxlaqsızın törəməsi; bicə dözmək; Necə dözmək?* B.Vahabzadə.

**XURAFAT** *is.* [*ər.*] Mövhumat. *Zülm nə din bildi, nə dil, nə Vətən; Cəhalət uydurdu İslam adına; Açıqfikirlilər qaçdı ölkədən; Dözməyib cahilin xurafatına.* B.Vahabzadə. // *məc.* Əfsanə, nağıl, uydurma. *Və ya ki Şuşədə bir sərsəmin xurafatı; Səhifələr ilə məşğul edər "Füyuzat"ı.* M.Hadi. [Bahadır:] *Ey ağlını qayıb etmiş qoca, nə üçün bu*

*avam zavallıları belə xurafat ilə aldadırsan?* S.S.Axundov.

**XURAL** *is.* [*monq.*] Monqolustanda ali dövlət hakimiyyəti orqanı.

**XURAMAN** *sif.* [*fars.*] *klas.* Nazla, əda ilə yeriyən, nazlana-nazlana, sallana-sallana yeriyən. *Sərvi-azad qədinlə mənə yeksan görünür; Nəyə sərgəştə olan baxsa xuraman görünür.* Füzuli. *Dilqəməm, qarşıma çıxdı xuraman; Bir şəbi-yeldadə bir mahi-taban.* Aşıq Dilqəm. ☐ **Xuraman olmaq** – naz və əda ilə, nazlı-nazlı, sallana-sallana yerimək. *Ey şaxi-gül, ol qaməti-mövzun həvəsindən; Çox sərv bu gülşəndə xuraman olacaqdır.* Qövsi. 2. **Sərvi-xuraman** şəklində – klassik şeirdə gözəlin epitetlərindən biri. *Lütf edibsən, məgər ey bad! Bu gündən böylə; Verəsən bir xəbər ol sərvi-xuramanımdan.* Füzuli. *Boyu yaraşıqlı, sərvi-xuraman; Əndamıdır ağ gül, sinəsi meydan.* M.P.Vaqif.

**xuraman-xuraman** *zərf* Nazla, əda ilə, sallana-sallana, nazlana-nazlana. *Pəri Soltan xuraman-xuraman gəlib, özünü zindanın qapısına yetirdi.* (Nağıl). *Səs-səsə verəydi həzarə, bülbül; Düşəydi payinə bənövşə, sünbül; Xuraman-xuraman əlində də gül; Gəzəydin hər tərəf bağı, görəydim.* Q.Zakir. *Səhər vaxtı, yarəb! Nə gördüm ki, canan; Gəlir şadü xəndan, xuraman-xuraman.* H.Cavid.

**XURCUN** *is.* İçərisində şey qoymaq üçün adətən yük və ya minik heyvanlarının belindən aşırılan, palaz kimi toxunan, ya da cod parçadan tikilən ikigözlü torba, iri heybə. *At belinə xurcun qoymaq. Xurcunu tərkinə salmaq.* – [Əhməd] *..başına bir çəllək soyuq su tökülmüş adam kimi kor-peşman yenidən malları bir-bir xurcuna yükləyib* [eşşəyə] *mindi.* B.Talıblı. *Tahir isə anasından dolu xurcunu alıb mətbəxə apardı..* M.Hüseyn. *Başında çal papaq, çiynində xurcun; İldırım çaxırdı gözündə onun.* B.Vahabzadə.

**XURD-XƏŞİL** *zərf* Əzik-əzik, xıncım-xıncım, sağ-salamat yer qalmamış, sınıq-sınıq. *Amma birdən işdi mən çölə-zada çıxmalı olsam, sən gərək xurd-xəşil olasan.* "Koroğlu". *Elə o günü məntəqəyə bütün bilək sümüyü xurd-xəşil olmuş bir yaralı gətirdilər.* Ə.Əbülhəsən. [Qarakişi Hümmətə:] *Sən öləsən,* [Yusif] *səni boz atdan elə salacaq ki, qabırğaların xurd-xəşil olacaq.* B.Bayramov. ☐ **Xurd-xəşil etmək** – bərk əzişdirmək, əzik-əzik etmək, bədənində sağ-salamat yer qoymamaq. *Mollabacı biçarə mütəalliməni xurd-xəşil edəndən sonra həyətə çıxdı və üzünü qonşuya tutub, ağzına gələni dedi..* Çəmənzəminli. [Sərnişinlərdən biri:] *Dünən Qara şəhərdə qoca bir arvadı tramvay aldı altına, xurd-xəşil elədi.* Qantəmir.

**XURMA** *is. bot.* 1. Subtropik və mülayim iqlimli ölkələrdə bitən, lələkvari yarpaqları çətir kimi olan uca ağac və bu ağacın şirin meyvəsi. *Qayada ilan ötər; Bağdadda xurma bitər; Ay qız, elə sallanma; Cavanam, ağlım itər.* (Bayatı). [Teybə] *..evə yolu düşəndə Bahadır üçün həmişə fındıq, qoz, saçaqlı konfet, iydə və bəzən xurma gətirərdi.* M.Hüseyn.
2. B a x **xırnik**. *..Xurma toxumunun qabığı qalın olduğuna onlar bir neçə ildən sonra göyərir, ona binaən onları tez göyərtməkdən ötrü Avropa bağbanları bu toxumların qabığını üsul yarıb sonra əkirlər.* "Əkinçi".

**XURMALIQ** *is.* Xurma ağacları bitmiş yer, xurma ağacları əkilmiş yer; xurma bağı. *Gah xurmalıqlar görünür, gah dupduru göllər; Gah qanlı ilkindi; gah alovlu səhər.* R.Rza. [Leyli Məcnuna:] *Gedək o xurmalıqdakı sərin çeşmədən bir ovuc su içək.* Ə.Məmmədxanlı. *Qəzənfər .. şəhərin kənarındakı xurmalıqda gizləndi..* S.Vəliyev.

**XURMAYI** *sif.* Xurma rəngində, açıq-qəhvəyi. *Xurmayı göz. Xurmayı saç. – Həcər gözlərini sildi, geri çəkildi, onun nəzəri Nəbinin divardan asılmış xurmayı papağına sataşdı.* S.Rəhimov.

**XURMAYISAÇ(LI)** *sif.* Saçları xurmayı olan. *On altı-on yeddi yaşlarında, qamətli, xurmayısaç .. qız, utancaq tərzdə gözlərini yerə zilləmişdi.* M.Hüseyn. *Bir azdan .. xurmayısaçlı, incəbel, yaraşıqlı bir qız olan Səriyyə .. gəlib çıxdı.* İ.Əfəndiyev.

**XURŞİD** *is.* [*fars.*] *klas.* Günəş. // Klassik şeirdə gözəlin epitetlərindən biri. *Xurşidim, xavərim, hilalım sənsən; Şəkərim, şərbətim, zülalım sənsən.* M.V.Vidadi. *Sən hüsndə xurşidi-fələkdən də gözəlsən; Ya əyri qaşından nəyi artıqdı hilalın.* Ə.Vahid.

**XURŞİDVƏŞ** *sif.* [*fars.*] *klas.* Günəş kimi gözəl, günəş camallı. *Qoyma, ey xurşidvəş, gözdən məni şəbnəm kimi.* Qövsi.

**XURT: xurt düşmək** – bihuş olub sərilmək. *Qız xörəyi hazırlayıb bihuşdarını da daxil elədi içinə, gətdi ortalığa. Səlim bir az yeyənnən sora xurt düşdü.* (Nağıl).

**XURUŞ** *is.* [*fars.*] Plovla yeyilmək üçün ayrıca bişirilib hazırlanan ət, toyuq, kişmiş və s.-dən ibarət yemək; qara. *Balaca nimçələrdə tirmə süfrənin ortasına düzülmüş xuruşlar və yeməklər hamıdan artıq Məşədi Məmmədin diqqətini cəlb edirdi.* B.Talıblı. *..Kiçik qazançalarda aş üçün azacıq əvvəl kəsilən üç qoyunun ətindən xuruş* [qara] *hazırlanırdı.* Ə.Əbülhəsən. [Çiyələk] *plovun xuruşlarını hazırlamağa girişdi.* B.Bayramov.

**XUŞGƏBAR** *is.* [*fars.*] Quru meyvə. *Xuşgəbar dükanı. – İldə neçə dəfə böyük karvanlar Hacı Səlim Sərdarovun xuşgəbar yüklərini Xorasandan Türküstana gətirirdilər.* Ə.Haqverdiyev. [Hacı Seyidin] *iki paroxod xuşgəbarı dənizdə batmışdı.* Mir Cəlal.

**XUŞGƏBARÇI** *is. kohn.* Xuşgəbar satan adam. *Bakıda iri ticarətlə məşğul olan düyüçülər, xuşgəbarçılar, ipəkçilər, xalçaçılar, qaraneftçilər də az deyildi.* H.Sarabski.

**XUŞGƏBARFÜRUŞ** [*fars.*] *köhn.* bax **xuşgəbarçı**. *Mirzə Nəsib .. Xəlilin anasını xatircəm edib yola saldı və Xəlili özü ilə götürüb öz dostu Ağa Hüseyn xuşgəbarfüruşun yanına apardı.* Ə.Haqverdiyev.

**XUTOR** [*rus.*] 1. İçərisində sahibinin evi və təsərrüfatı olan ayrıca mülk.

2. Kazak stanitsalarından köçüb gələnlərin saldıqları kənd.

**XUTORÇU** *is. tar.* 1. Xutor (1-ci mənada) sahibi.

2. Xutor (2-ci mənada) əhalisindən olan; xutorlu.

**XUTORLU** bax **xutorçu** 2-ci mənada.

**XÜLASEYİ-KƏLAM** bax **xülasə** 1-ci mənada. *Xülaseyi-kəlam, bu işin üstündən tamam üç il keçdi.* E.Sultanov. *Xülaseyi-kəlam, camaat bir vaxt gözünü açdı, gördü ki, Xudayar bəy katdadı ki, katdadı.* C.Məmmədquluzadə.

**XÜLASƏ** *is.* [*fars.*] 1. Müxtəsər, bir sözlə, uzun sözün qısası. *Xülasə, daha nə deyim, baharın bu gözəl ayında bizim ölkə kimi gözəl ölkə az tapılar..* E.Sultanov. *Xülasə, faytonçu yarım saat məni səhra ilə gətirdi.* Ə.Haqverdiyev. [Qüdrət:] *Xülasə, bədbinləşmək lazım deyil.* M.Hüseyn.

2. Bir əsərin, nitqin və s. qısaca məzmunu, nəticəsi, mahiyyəti. *Romanın xülasəsini danışmaq.* ◻ **Xülasə etmək** – qısa məzmununu vermək.

3. Nəticə, yekun. *Əcəba o zavallı qarı altmışillik ömrünün acı fəlsəfəsinin xülasəsi olan o ibarəni neçə dəfə təkrar etmişdi?* A.Şaiq. *Doğrudur,* [Kərbəlayı Əzimin] *yanında Dilşadın adını çəkməyirlərdi, amma ümumi məsələdən xülasə çıxarmaq çətin deyildi.* T.Ş.Simurq.

**XÜLƏFA** *is.* [*ər.*] *köhn.* Xəlifələr. [Həqiqət:] *Mənim şəfəqim Misir fironlarının, Roma qeysərlərinin, Kəyaniyan və Sasaniyan şahənşahlarının, Bəni-Üməyyə, Bəni-Əbbasiyyə xüləfasının qəsrlərinə, turan və türk xalqlarının qəsrlərinə düşübdür.* Ə.Haqverdiyev.

**XÜLQ** *is.* [*ər.*] Xasiyyət, təbiət. *Sənətkar xülqünə hopmuşdu onun; Təlim-tərbiyənin zövqü, ahəngi.* Şəhriyar.

**XÜLUS** *is.* [*ər.*] *köhn.* 1. Xalislik, saflıq. *Hər kəs öpər əlimdən; İzhar edər xülusi..* A.Səhhət.

2. Səmimilik. *Vətən uğrunda, millət eşqində; Bəzli-can et xülusi-niyyət ilə!* M.Ə.Sabir. *Kişinin ki, əqidəsi möhkəm oldu və xülusü qəlb ilə əlinə qələm aldı, onun ərizəsi daşdan keçər.* Ə.Haqverdiyev.

**XÜLYA** [*ər.*] Xəyal, xəyalət, xamxəyal, fantaziya. *Birdən lap qulağının dibində eşidilən qəfil bir qışqırıq Qadiri bu xülyalarından ayırdı.* Ə.Əbülhəsən. *Haman bu Yalınçaq bəy də Baniçiçəyi almaq xülyasına düşmüşdü.* M.Rzaquluzadə. *Həmid bu məsud şirin xülyalara o qədər dalır ki, balaca Müslümün başını onun dizinə qoyaraq, yuxuladığını hiss etməyir.* Ə.Məmmədxanlı.

**XÜLYAÇI** bax **xəyalçı**.

**XÜLYAÇILIQ** bax **xəyalçılıq**.

**XÜLYAPƏRVƏR, XÜLYAPƏRƏST** [*ər.* xülya və *fars.* ...pərəst] bax **xəyalpərəst**. *Ögey qardaşı uşaqlarından başqa heç bir kəsi olmayan bu müəllim xəyalpərvər bir adam idi.* M.İbrahimov.

**XÜLYAPƏRVƏRLİK, XÜLYAPƏRƏSTLİK** bax **xəyalpərvərlik**. *Onlar əksərən xəyalpərəst gənclər, geniş ictimai fəaliyyət meydanı axtaran və həqiqi azadlıq üçün çırpınan gənc tələbələr idi.* M.İbrahimov.

**XÜMS** *is.* [*ər.* "beşdə bir"] İslam dinində: varlı adamın öz gəlirinin, qazancının beşdə bir hissəsi miqdarında kasıblara verməli olduğu vergi. *Camaatın, xüsusən sərvətdarların xümsü, zəkat və fitrəsi ağanın mübarək əlilə paylanardı.* Ə.Haqverdiyev. *Fitrə, zəkat, xüms, həcc və Kərbəlanı ziyarət etmək kimi "təkliflərin" hamısı Əhmədin tərəfindən danışıqsız qəbul edilirdi.* B.Talıblı. // *məc.* Klassik şeirdə gözəlin iltifatına, mərhəmətinə işarə. [Həcər xanım:] *Olar gözəllərin xümsü, zəkatı; Cavana yetişər, çala yetişməz.* Aşıq Ələsgər.

**XÜRRƏM** *sif.* və *zərf* [*fars.*] *klas.* Şad, şən, qəm-qüssədən uzaq, sevinc, fərəh içində olan (çox zaman şad və xürrəm şəklində işlənir). *Böyük xanım şad və xürrəm gümüş podnos içində iki istəkan kəmrəng çay gətirmişdi.* M.S.Ordubadi. *Hamı şad, xürrəm evinə qayıtdı.* N.Nərimanov. *Kələyin baş tutmasından şad və xürrəm halda Mahmud bayıra çıxıb evinə qayıdarkən* [arvadının] *qəflətən çarşabı qoltuğuna vurub yeznəsi ilə getməsini müşahidə edir.* B.Talıblı. ☐ **Xürrəm olmaq** – şad olmaq, sevinmək, fərəh içində olmaq. *Xürrəm oluram, o olsa xürrəm; Qəm yetsə ona, mənə yetər qəm.* Füzuli. *Əhdi dürüst ola, iqrarı möhkəm; Gözündən irağa düşəndə bir dəm; Nə könlü açıla, nə ola xürrəm; Fikri, zikri sənin sarı gərəkdir.* Q.Zakir.

**XÜRUC** *is.* [*ər.*] *klas.* Çıxma, bayıra çıxma. ☐ **Xüruc etmək** – çıxmaq. .. *o İskəndər Rumi idi ki, Məqduniyyə adlı ufaq bir ölkədən xüruc eləmişdi və gəlmişdi Əcəm ölkəsindəki bütün atəşgədələri dağıtmışdı..* Ə.Məmmədxanlı. // Zühur etmə, zahir olma, ortaya çıxma. [Axund:] *Yəqin dünyanın axırı və Dəccalın xürucu yaxınlaşıb.* Ə.Haqverdiyev.

**XÜSUS** [*ər.*] 1. Xas olma, məxsus olma; məxsusluq, bir şeyə və ya şəxsə aid olma.

2. Nisbət şəkilçilərlə: *xüsusda, xüsusunda* – haqqında, barəsində; barədə, dair. *Bu xüsusda sonra danışarıq. Bu xüsusda fikriniz nədir? Getmək xüsusunda nə qərara gəldin?* – [Dəsturov] *hər məsələ xüsusunda hər idarəyə ərizə yazardı.* Ə.Haqverdiyev.

**XÜSUSƏN** [*ər.*] *zərf* Xüsusi olaraq, hamıdan artıq, ən çox, hər şeydən əvvəl, ayrıca, ələlxüsus. *Xüsusən ev qulluqçuları, gədə, Almas və qulluqçu qız Pəri o gecə səhərə kimi yatmamışdılar.* N.Nərimanov. *Bu böyük itki, bu kədərli faciə bütün qohum-qardaşa, xüsusən Atabalaya çox ağır təsir etdi.* A.Şaiq. *Qumru çox azdanışan, xüsusən müavinlə söz güləşdirməyən bir arvad idi.* Ə.Əbülhəsən.

**XÜSUSİ** *sif.* [*ər.*] 1. Ancaq ayrıca bir şəxsin özünə aid olan, özü ilə bağlı olan, özünə xas olan; şəxsi, fərdi. *Xüsusi təşəbbüs. Başqasının xüsusi həyatına qarışmaq.* – [Məcid Əfəndi:] *Yaxşı ki gəldiniz, sizinlə xüsusi bir işim daha var..* H.Cavid.

2. Şəxsi mülkiyyətlə, fərdi təsərrüfatçılıqla və bundan doğan ictimai-iqtisadi münasibətlərlə bağlı olan. *Xüsusi alver. Xüsusi mülkiyyət. Xüsusi təsərrüfat.* // Kollektivə, cəmiyyətə, dövlətə və s.-yə deyil, ayrıca şəxsə, sahibkara məxsus olan; şəxsi. *Xüsusi mal. Xüsusi kitabxana. Xüsusi ev. Xüsusi maşın.* // Ayrı-ayrı şəxslər tərəfindən icra edilən, dövləti xidmət xaricində olan. *Xüsusi sifariş. Xüsusi dərs götürmək. Həkimin xüsusi qəbulu var.*

3. Başqalarından fərqlənən, səciyyəvi xüsusiyyəti olan; qeyri-adi. *Xüsusi əlamət. Müğənninin səsində xüsusi bir məlahət var. Xüsusi bir əda ilə danışmaq.* // Bir şeyin, ya şəxsin fərqləndirici xüsusiyyətini təşkil edən, ancaq müəyyən bir şəxsə, ya şeyə, hadisəyə xas olan; spesifik, səciyyəvi, özünəməxsus. *Bəzi dərmanların xüsusi iyi var. İşin xüsusi cəhətlərinə diqqət yetirməli. Bu yeməklərin xüsusi ləzzəti var.*

4. Ancaq müəyyən şəxslər və ya məqsəd üçün olan; məxsusi. *Qəzetin xüsusi nömrəsi. Nümayəndələr xüsusi qatarla yola düşdülər. Teatrda xüsusi yerlər. Xüsusi komissiya işə başlamışdır.*

5. Ayrıca götürülmüş, ayrı-ayrı, təsadüfi, qeyri-səciyyəvi, müstəsna. *Xüsusi hallarda. Xüsusi faktları qanun kimi götürmək olmaz.*

6. Elm, texnika, sənət və s.-nin hər hansı bir sahəsinə aid olan. *Xüsusi təhsil məktəbi. Xüsusi fənlər.*

7. Daha böyük, daha güclü, daha mühüm. *Xüsusi bir məhəbbətlə sevmək. Xüsusi qayğı göstərmək. Xüsusi zəhmət tələb edən iş.*

◊ **Xüsusi müxbir** – işlədiyi qəzeti (jurnalı) müntəzəm surətdə informasiya ilə təmin edən qəzet və ya jurnal əməkdaşı. *M.Ə.Sabir* "*Həyat*", "*İrşad*" *və* "*Tazə həyat*" *qəzetlərinin Şamaxı üzrə xüsusi müxbiri olmuş, həmin qəzetlərdə müntəzəm surətdə çıxış etmişdir*. M.Məmmədov.

**XÜSUSİLƏ** *zərf* [*ər.*] Ələlxüsus, xüsusən. [Mirzə Qədir] *əlavə olaraq orasını da bildirdi ki, Nəsir evdə onun qardaşı isə də, həyatda, xüsusilə mətbəəsində qardaşı deyildir.* S.Hüseyn. *Xüsusilə qaragözlü qız həm maraq, həm də ürkək nəzərlərini Mayaya dikmişdi.* M.İbrahimov. *Pəncərədən Adilənin çiyni üstündən sıra dağlara tərəf açılan mənzərə bu axşam xüsusilə möhtəşəm idi.* Ə.Məmmədxanlı.

**XÜSUSİLƏŞMƏ** *is.* 1. "Xüsusiləşmək"dən *f.is.*

2. *qram.* Cümlə üzvlərinin bir qisminin xüsusi səs tonu ilə deyilib, məntiqi vurğu ilə o birilərindən fərqlənməsi halı. *Cümlənin ikinci dərəcəli üzvlərinin xüsusiləşməsi. – ..Şagirdlər sintaksisi keçərkən öyrənirlər ki, xüsusiləşmələr cümlədəki başqa üzvlərdən intonasiyaca fərqlənir və fasilə ilə ayrılır.* "Orta məktəbdə yazı metodikası".

**XÜSUSİLƏŞMƏK** *f.* 1. Başqalarından, ümumilikdən ayrılmaq, xüsusi mövqe tutmaq.

2. *qram.* Xüsusiləşmə (2-ci mənada) əmələ gəlmək.

**XÜSUSİLƏŞMİŞ** *f.sif. qram.* İntonasiyaya və cümlənin digər üzvlərinə münasibətə görə cümlənin nisbətən müstəqil tərkib hissəsinə çevrilmiş.

**XÜSUSİLİK** *is.* Özünə məxsus olma, özünə aid olma, xüsusi mahiyyət daşıma, fərdi səciyyə daşıma, şəxsi xarakter daşıma. *..Məktubun xüsusiliyini nəzərə alaraq imkan vermişlərdi ki, Kaşani əvvəl özü oxusun.* Qantəmir.

**XÜSUSİYYƏT** *is.* 1. Hər hansı bir şeyi digərindən ayıran səciyyəvi cəhət, əlamət, keyfiyyət, xassə, spesifiklik. *Şoran torpaqların xüsusiyyəti. Yaşayış xüsusiyyəti. –* "*Qorxulu nağıllar*"*ın bir xüsusiyyəti də odur ki, müəllif heyvanlar aləmindən .. danışır, gənc oxucularını onlarla tanış edir.* S.S.Axundov. [Fikrət:] *Bizim trestin yarısı dənizdədir. Oranın xüsusiyyətlərini unutmaq olmaz.* M.Hüseyn.

2. Xüsusiyyətçilik.

**XÜSUSİYYƏTÇİ** *is.* Bir şeyin sahibi, mülkiyyətçi; yiyə, sahibkar.

**XÜSUSİYYƏTÇİLİK** *is.* Yiyə, sahibkar olma, mülkiyyətçilik.

**XÜTBƏ** *is.* [*ər.*] *din.* Xətibin minbərdən camaata xitabən söylədiyi nəsihətamiz sözlər, nitq. *Əmir İnanc xətibin qulağına pıçıldadıqdan sonra xətib təzə səfərbərlik haqqında bir söz danışmayaraq xütbəsini bitirdi.* M.S.Ordubadi.

# İi

**İ** Azərbaycan əlifbasının on dördüncü hərfi və bu hərflə işarə olunan saitin adı.

**İANƏ** *is.* [*ər.*] *köhn.* Bir xeyir iş üçün, yaxud ehtiyacı olan bir adam və ya cəmiyyət üçün verilən və toplanılan pul; maddi yardım, kömək. *İanə vermək. İanə toplamaq.* – [Yaşlı kişi:] *Mən .. Hacı Ramazanın Xorasan ac və yoxsulları üçün göndərdiyi min manat ianəsini öz əlimlə ona təslim etmişdim.* S.Hüseyn. *İanə verənləri mətbuat səhifələrində adbaad elan etmək çətin idi.* Mir Cəlal. *İanə almaq üçün dükanın qabağına toplaşanların içərisində Oruc da var idi.* Ə.Vəliyev.

**İANƏÇİ** *is.* İanə verən, maddi kömək göstərən, yardım edən.

**İANƏT** *klas.* b a x **ianə.** [Yusif şah:] *Dullara və yetimlərə və şillərə və korlara ianət və himayət göstərilsin.* M.F.Axundzadə.

**İAŞƏ** *is.* [*ər.*] 1. Yedirmə, yedirib-içirmə.

2. Qida, yeyəcək, yeyinti. ◻ **İaşə müəssisəsi** – yeməkxana, aşxana, kafe və s.

**İAŞƏÇİ** *is.* İaşə işləri ilə məşğul olan, yeyinti müəssisəsi işçisi.

**İBADƏT** *is.* [*ər.*] 1. Dua oxuma, namaz qılma şəklində icra edilən dini ayin. [Molla İbrahimxəlil:] *Əgər məni görmək istəsələr, de ki, ustadım .. ibadətdədir.* M.F.Axundzadə. *Məlum şeydir ki, indiyədək saydığımız ibadətlər ki, növ-növ namazlardan ibarət olsun, məhz ondan ötrüdür ki, insan öləndən sonra, axirətdə mizan-tərəzi qurulanda yaxşı imtahan versin.* C.Məmmədquluzadə. ◻ **İbadət etmək** – dini ayinlərlə məşğul olmaq, dua oxumaq, namaz qılmaq. *Adamlar məbudun qarşısında bardaş quraraq dizi üstə oturub ibadət edir, dodaqaltı dua oxuyurlar.* M.İbrahimov.

2. Sitayiş, pərəstiş. ◻ **İbadət etmək** – sitayiş etmək, səcdə etmək. *Oda ibadət etmək. Bütlərə ibadət eləmək.* // Məc. mənada. *Qiblə deyil, qaşlarına baş əymək; Gecə-gündüz mənim ibadətimdir.* M.P.Vaqif. *Məscidü minbər nə lazım maili-rüxsarına; Qaşların vəqti-ibadət aşiqə mehrabdır.* S.Ə.Şirvani.

**İBADƏTÇİ** *is.* İbadətlə məşğul olan adam, vaxtını ibadətdə keçirən adam.

**İBADƏTGAH** *is.* [*ər.* ibadət və *fars.* ...gah] İçərisində ibadət edilən yer, ibadət yeri, məbəd (məscid, kilsə və s.). [Tahirzadə] *burada – cüt minarələri ilə göylərə yüksələn ibadətgahda, zahidlər məclisində imtahan verməli idi.* Mir Cəlal.

**İBADƏTXANA** [*ər.* ibadət və *fars.* ...xanə] b a x **ibadətgah**. [Sönməz:] *Ərəblər əvvəlləri .. böyük mərkəzlərdəki ocaqlara, ibadətxanalara toxunmurdular.* C.Cabbarlı.

**İBADƏTKAR** *is.* və *sif.* [*ər.* ibadət və *fars.* ...kar] İbadət edən, səcdə edən, səcdəedici. [Ərən:] *Mariqeri diz çökərək Sfinks heykəlinin üst səkisində oturan bir qızın ayaqlarını qucuyub ibadətkar bir vəziyyət almışdı.* Çəmənzəminli.

**İBARƏ** *is.* [*ər.*] 1. Kəlam; iki və ya bir neçə kəlmədən ibarət tərkib. *Gözlüyümü gözümə taxıb bir yerindən bu ibarəni çətinliklə oxuya bildim.* C.Məmmədquluzadə. *..Bir parça əlfaz və ibarələri cənab mütərcim eyni ilə rusdan türk lisanına tərcümə etmələri ilə əsil mənanı dolaşdırıb çətinə salıbdır.* F.Köçərli. *Vəkilin hər sözü, hər ibarəsi; Bir tikan çıxarır onun qəlbindən.* B.Vahabzadə.

2. Qəliz, təmtəraqlı, əksərən mənasız, boş söz, ifadə. *İbarələr dolu kimi yağar onun ağzından; Otuz dəfə məhəbbətə düçar olmuş azından...* S.Vurğun. *Əhyələrdə gecə yarısı avam camaat məscidlərə dolub, mollanın ərəbcə dediyi anlaşılmaz ibarələrini dinlər, sonra hər kəs evinə qayıdardı.* H.Sarabski. ◻ **İbarə satmaq** – qəliz, təmtəraqlı danışmaq.

**İBARƏBAZ** [*ər.* ibarə və *fars.* ...baz] b a x **ibarəpərdaz**.

**İBARƏBAZLIQ** b a x **ibarəpərdazlıq**. *İbarəbazlıq fikrin boşluğuna və bir dərəcədə yoxluğuna dəlalət eləyir.* F.Köçərli.

**İBARƏÇİ** b a x **ibarəpərdaz**.

**İBARƏÇİLİK** b a x **ibarəpərdazlıq.**

**İBARƏLİ** *sif.* Təmtəraqlı, qəliz, ibarələrlə dolu. *İbarəli yazı.* – *Armudboğaz, şişbığ satıcının belə ibarəli nitqindən baş açmayan Leylək istər-istəməz əsəbiləşdi..* S.Rəhimov.

**İBARƏLİLİK** *is.* İbarələrlə dolu olma, təmtəraqlılıq, qəlizlik.

**İBARƏPƏRDAZ** *is.* [*ər.* ibarə və *fars.* ...pərdaz] Danışığında və ya yazısında qəliz, təmtəraqlı ibarələr işlətməyi sevən adam.

**İBARƏPƏRDAZLIQ** *is.* Qəliz və təmtəraqlı ibarələr işlətmək həvəsi, meyli.

**İBARƏT** [*ər.*] 1. Mütəşəkkil, düzəlmiş, tərtib olunmuş. *Beş adamdan ibarət heyət. Mütəxəssislərdən ibarət komissiya. Dörd nəfərdən ibarət ailə. Tələbələrdən ibarət komanda. – Nəhayət, Toğrul iraqlılardan ibarət bir dəstə qoşun təşkil etmək və Hüsaməddinin əlində olan qoşunu tərk-silah etdirmək qərarına gəldi.* M.S.Ordubadi.

2. **İbarətdir** şəklində – eyniyyət bildirir. *"Veçer" ibarətdir bir məclisdən ki, axşam vaxtı oraya adamlar cəm olub söhbətə, qiraətə, musiqiyə və yeyib-içməyə məşğul olurlar.* C.Məmmədquluzadə. *Bu xəndək bir kilometr uzunluğu, qırx metr eni, otuz metr dərinliyi olan nəhəng bir dərədən ibarətdir.* Ə.Sadıq. // Mütəşəkkildir. *"Uzunqulaqlı" kəndi səkkiz yüz evdən ibarətdir.* Ə.Haqverdiyev. *Dərə qərbə doğru getdikcə qayalıq, dağlıq, iri və oyuq daşlarla dolu qorxunc yerlərdən ibarətdir.* A.Şaiq. ◻ **İbarət olmaq** – 1) ...mütəşəkkil olmaq, ...düzəlmiş olmaq; 2) ehtiva etmək, ...məzmununu təşkil etmək. [Zeynal] *Mehribanı Bakıya gətirdikdən sonra birinci yapdığı iş, onun çadrasını başından atmaq, onu tanış-bilişləri ilə tanış etməkdən ibarət olmuşdu.* S.Hüseyn.

3. *klas.* b a x **ibarə** 2-ci mənada. *Şeyxə verdi xəbər qiraət ilə; Mədd ilə, çox uzun ibarət ilə.* S.Ə.Şirvani. *Rusun qədim yazıçıları yazı yazanda elə bir kəlmə və ibarətlər tapıb işlədirdilər ki, xoruz səsi eşitməmiş olsunlar.* C.Məmmədquluzadə. *"Millət ötrü, ağlayan axırda olur kor"; Məzmunlu məsəldir bu ibarət, uçitellər!* M.Ə.Sabir.

**İBÇİN** b a x **ifçin.** [Səttar:] *Gözlərinin qırağına elə bil qara qaytan tutulub, dırnaqları ibçindir.* P.Makulu.

**İBERLƏR** *is.* [*tar.*] 1. İberiyanın əsas əhalisini təşkil edən qədim şərqi gürcü qəbilələri.

2. Qədim İspaniyada yaşayan bir qrup qəbilənin adı.

**İBLİS** *is.* [*ər.*] 1. Şeytan. [Odabaşı:] *Cəhənnəm əhli iblisi arakəsməyə salıblar.* Ə.Haqverdiyev. [Mələk:] *Yox kimsədə insafü mürüvvət; İblisəmi uymuş bəşəriyyət?!* H.Cavid.

2. *məc.* Araqarışdıran, fitnə salan, fitnəkar, hiyləgər. *Sanki iblis oynayır bir rol, ona şər əl çalır.* Ə.Nəzmi. *Yer üzündə nə xəyanət, nə də iblis qalacaqdır.* S.Vurğun.

**İBLİSANƏ** *sif.* və *zərf* [*ər.* iblis və *fars.* ...anə] b a x **iblisvari.**

**İBLİSCƏSİNƏ** b a x **iblisanə**.

**İBLİSLƏŞMƏ** "İblisləşmək"dən *f.is.*

**İBLİSLƏŞMƏK** *f.* Fəsadlaşmaq, hiyləgər, fitnəkar olmaq. *Nə iblisləşmisən?*

**İBLİSLİK** *is.* Ara qarışdırma, araya fitnə salma, fəsadçılıq, fitnəkarlıq, hiyləgərlik.

**İBLİSVARİ** *zərf* İblis kimi, şeytan kimi, şeytancasına. *Qəşəm şaqqa çəkib iblisvari güldü.* S.Rəhimov.

**İBN** [*ər.*] Oğul (yalnız izafətlərdə işlənir). *Əbubəkr ibni-Məhəmmədin göndərdiyi məktubu sizə oxumaq istəyirəm.* M.S.Ordubadi. [Şeyx Sənan:] *İbni-Məryəm asıldı darə, fəqət; Onu təkrarə varmıdır hacət?* H.Cavid.

◊ **İbni-adəm** *klas.* – Adəm övladı, insanlar.

**İBRANİ** *is.* [*ər.*] 1. Qədim yəhudilərin adlarından biri.

2. Qədim yəhudi dili.

**İBRAZ** [*ər.*]: **ibraz etmək (eləmək)** *köhn.* – büruzə vermək, aşkar etmək, üzə çıxarmaq, meydana çıxarmaq, göstərmək. [Mirzə Səməd:] *Ömrün uzun olsun, deyə minnətdarlıq hisslərini ibraz etmədən çəkinməzdi.* Çəmənzəminli. [Bahadır bəy:] *Biz türklər öz sədaqətimizi ibraz etməyə hazırıq.* C.Cabbarlı.

**İBRƏ¹** *is.* [*ər.*] İynə, mil, əqrəb. *Saat ibrəsi. Kompas ibrəsi.*

**İBRƏ²** *is. köhn.* Əldətoxunma şal, yun parça. [Xırdaxanım:] *Mən də sənə borclu oluram bir dəst şaldan libas ibrə işləməli.* N.Vəzirov. [Odabaşı:] *Hətta Mirzə Əhməd ağa bir ədəd ibrə şalından canamaz .. qız üçün ənam göndərmişdi.* Ə.Haqverdiyev.

**İBRƏT** [*ər.*] Ağır, pis bir hadisədən, işdən alınan dərs. *Olmuş bizə qismət bu yəqin, ruzi-əzəldən; İbrət bizə yox, halətidünyanı görəndə.* Aşıq Aslan. ◻ **İbrət almaq (eləmək, götürmək)** – bir işdən, hadisədən dərs almaq, özü üçün nəticə çıxar-

maq, nümunə götürmək, öyrənmək. *Böyüyü döy ki, kiçik ibrət alsın.* (Ata. sözü). *Gəl, könül, bir ibrət al, bu gərdişi-dövrana bax!* M.V.Vidadi. *Ey oğul, murdən götür ibrət; Get, ağır işdə işlə qeyrət ilə.* M.Ə.Sabir. **İbrət dərsi almaq** – b a x **ibrət almaq.** *Doğrudur, cənab general! – dedim, 11-ci ilin hadisəsindən biz bir ibrət dərsi alacağıq.* M.S.Ordubadi. *İşlərə açıq baxıldığı üçün iclas salonunda iştirak edən bütün vətəndaşlar məhkəmənin çıxardığı bu hökmdən bir ibrət dərsi alırlar.* (Qəzetlərdən). **İbrət dərsi vermək** – b a x **dərs vermək** (“**dərs**”-də). *Bu yaramazların kökünü kəsib, hamıya ibrət dərsi vermək lazımdır.* M.Hüseyn. **İbrət olmaq** – b a x **dərs olmaq** (“**dərs**”də). [Hacı Qara:] *Allah qoysa, sizin ölüm xəbəriniz murova çatar! Bundan sonra qalan yoldaşlarınıza ibrət olar.* M.F.Axundzadə. [Musa:] *Bu gün sizə öylə bir cəza verməliyim ki, bundan sonra hər kəsə ibrət olsun..* H.Cavid.

**İBRƏTAMİZ** *sif.* [*ər.* ibrət və *fars.* ...amiz] İbrət verən, ibrətverici, ibrətli. *İbrətamiz hekayə. İbrətamiz nağıllar. – Bu ibrətamiz və riqqətəngiz faciəni* [“Otello”nu] *ədibi-binəzir Şekspir ziyadə məharətlə tərtib və tənzim edibdir.* F.Köçərli. *Kərim dayı, dünya görmüsən, saç-saqqal ağartmısan, bizə yaxşı bir şey danış, ibrətamiz bir əhvalat nəql eylə.* M.İbrahimov.

**İBRƏTXANA** *is.* [*ər.* ibrət və *fars.* ...xanə] İbrət götürülən yer, tərbiyə evi. [Məmməd:] *Xeyr,* [teatr] *ibrətxanadır.* S.S.Axundov.

**İBRƏTLƏNDİRİCİ** b a x **ibrətli.**

**İBRƏTLƏNDİRMƏ** “İbrətləndirmək”-dən *f.is.*

**İBRƏTLƏNDİRMƏK** *f.* İbrət vermək, ibrət dərsi vermək, pis işdən çəkindirmək.

**İBRƏTLƏNMƏ** “İbrətlənmək”dən *f.is.*

**İBRƏTLƏNMƏK** *f.* Bir işdən, hadisədən və s.-dən dərs almaq, özünə nümunə götürmək, özü üçün nəticə çıxarmaq.

**İBRƏTLİ** *sif.* İbrət ola bilən, ibrət verən, ibrət alınmalı, nümunə götürülə bilən, ibrətverici, özü üçün dərs ala bilən. *İbrətli hadisə. – Əkbər siz deyən adamlardan olmasa da, özünə görə ibrətli həyat yolu var.* Mir Cəlal.

**İBRƏTVERİCİ** b a x **ibrətamiz.** *Şəkillərin arasında ibrətverici və hikmətli şeirlər yazılmışdı.* M.S.Ordubadi.

**İBRİQ** *is.* [*ər.*] Su və b. mayelər üçün qulplu və əmzikli qab. [Xəyyam:] *Badə ibriqimi qırdın, ya rəb! Dərdimi başdan aşırdın, ya rəb!* H.Cavid.

**İBRİŞİM** *is.* [*fars.*] İpək iplik.

**İBTİDA** *is.* [*ər.*] Başlanğıc, ilk, əvvəl (*intiha* ziddi.) *Ayın ibtidası. – İnsan, ömrünün ibtidasından intihasına qədər möhtacdır təhsili-ülumə.* H.Zərdabi. [Şeyx Sənan:] *Bir səfərdir bu, adəta, məchul; Qayə məchul, ibtida məchul...* H.Cavid. [Murad] *bu məqsədlə 1921-ci ilin ibtidasında Bakıdan çıxmış*(*dı*). S.Hüseyn. // *sif.* İlk, birinci. *Sonanın ibtida müəlliməsi nəhayətdə ağıllı və pedaqoji elminə qabil bir arvad idi.* N.Nərimanov. // *zərf* Əvvəlcə, ən əvvəl, ibtidada. *İbtida ustaddan dərsim alanda; Oxuyub yetişdim, ay sinə-sinə.* Aşıq Ələsgər. ◻ **İbtida etmək (qılmaq)** – başlamaq. *İbtida eyləyib girdim meydana; Aşıqlar ustadı, görün handadı?* Qurbani.

**İBTİDADA** *zərf* İlk dəfədə, başlanğıcda, əvvəldə. *Ki cahan içrə var eylə işlər; Nəzərə ibtidada xoş görünər.* S.Ə.Şirvani.

**İBTİDADAN** *zərf* Başlanğıcdan, əvvəlindən, başdan. [Xacə] *qəziyyəni ibtidadan intihayədək Yusif şaha nəql etdi.* M.F.Axundzadə. *İbtidadan eləsəm şərh bu əhvalı əgər: Uzanıb rişeyi-söz, nəzm düşər tulani.* S.Ə.Şirvani.

**İBTİDAİ** *sif.* 1. Başlanğıca aid, ən əvvəl olan; ilk. *Küçələrdə və meydançalarda gördüyünüz yaralılara ibtidai yardım* [ediniz]. M.S.Ordubadi.

2. Hələ mükəmməlləşməmiş, inkişaf etməmiş. *İbtidai həyat. – Həsən bəy inkişaf etməmiş, ibtidai və dağınıq təsərrüfatın artıb yüksəlməsinə çalışırdı.* M.İbrahimov.

3. Başlanğıc, ilk, dərəcə etibarilə aşağı. *İbtidai siniflər. İbtidai təhsil.* – [Qız] .. *ibtidai savad kursunu bitirmiş, ali savad kursuna girmək fikrindədir.* S.Hüseyn. *Aslan kənddə ibtidai məktəbdə oxuduğu zamanlar gecə-gündüz bu xəyallarla yaşayırdı.* M.Rzaquluzadə.

4. Bəşəriyyət tarixinin ən qədim (ilk) dövrlərinə aid olan. *İbtidai insanlar. İbtidai mədəniyyət qalıqları.*

5. Hazırkı dövr üçün köhnəlmiş, geri qalmış, ən adi, primitiv. *İbtidai adətlər. İbtidai geyimlər.*

◊ **İbtidai icma quruluşu** – b a x **icma**.

**İBTİDAİLƏR** *is. zool.* Birhüceyrəli heyvanlar qrupu.

**İBTİDAİLİK** *is.* İbtidai halda olma, ilk mərhələdə olma. // İlkinlik.

**İBTİDASIZ** *sif.* İbtidası, başlanğıcı olmayan.

**İBTİLA** *is.* [*ər.*] Bir şeyə xəstəlik dərəcəsində mübtəla olma; mübtəlalıq, düşkünlük. *Demək, Ələkbər yoldaş yenə də Hacı xanla qumar oynamış imiş. Onlar ikisi də ibtiladan yaxalarını qurtara bilmirlərdi.* M.S.Ordubadi. *Mirzağa buna ibtila dərəcəsində adət etmişdi.* S.Hüseyn.

**İCAB** [*ər.*]: **icab etmək** *kit.* – lazım olmaq, lazım gəlmək: vacib, labüd, zəruri olmaq. *Həqiqi inqilab nə qədər ki, dedikcə, böyük bir əmrdir, bu böyük əmri yerinə yetirmək üçün də .. amal və əfkarı uca olan adamların meydana çıxması icab edər.* Ü.Hacıbəyov. *Bunun üzərində danışmaq icab edirdi, halbuki gecə keçdiyindən* [müəllimin] *yuxusu gəlirdi.* S.Hüseyn.

**İCAD** *is.* [*ər.*] Vücuda gətirmə (gətirilmə), yoxdan var etmə (edilmə), yaratma (yaradılma), düzəltmə (düzəldilmə); ixtira (etmə), kəşf (etmə). *Radionun icadı. Telefonun icadı. Hürufatın icadı. Yeni icad* (yeni çıxmış şey, yeni ixtira). // Uydurma. *O necə xəstəlikdir, – dedim, – kimin icadıdır?* Mir Cəlal. □ **İcad etmək (eləmək)** – vücuda gətirmək, yoxdan var etmək, yaratmaq. *Parlaq günəşin həsrəti ruyinlə gözümdən; Qanyaş axıdıb Dəclələr icad edərəm mən.* Heyran xanım. // İxtira etmək. *Mən sizin üçün lap təzə bir xörək icad eləmişəm.* "Mol. Nəsr.". *O hansı elmdir ki, icad etdi telefonu?* M.Möcüz. *Yəqin bu ekskavatoru icad edənlər onun ağırlığını, həcminin iriliyini nəzərə alaraq, onunla yükləmək mümkün olmadığını düşünmüşlər.* Ə.Sadıq. // Uydurmaq, düzəltmək. [İblis:] *Bir qazi olub gah edərim fitnələr icad.* H.Cavid. **İcad olunmaq (edilmək)** – vücuda gətirilmək. *..Övladıma da vəsiyyət edəcəyəm ki, müsəlman dili üçün təzə bir hürufat icad olunmuyunca müsəlmanca bir kəlmə söz də yazmasınlar.* C.Məmmədquluzadə. // Uydurulmaq. *Möcüzə adamları aldatmaq üçün icad olunmuşdur.* Çəmənzəminli.

**İCARƏ** *is.* [*ər.*] Müəyyən şərtlər əsasında daşınmaz əmlakın müvəqqəti istifadəyə verilməsi, ya alınması; kirə. *İcarə haqqı. İcarə kağızı. İcarə şərtləri.* – [Kərbəlayı Qulam:] *Hacı, özünüz bilirsiniz ki, mərhum Ağa Heydərin hamamı mənim icarəmdədir.* N.Vəzirov. □ **İcarə etmək** – bir yeri müvəqqəti istifadə üçün kirə etmək. *Qasım kənddən çox uzaq bir yerdə bir parça torpaq icarə etmişdi.* Ə.Sadıq. **İcarəyə götürmək** – müəyyən şərtlərlə müvəqqəti istifadəyə götürmək. *Əhvalat belədir ki, otuz il bundan qabaq bir neçə müsəlman şəhər yerini icarəyə götürüb başlayıblar əkinçilik ilə güzəran eləməyə..* C.Məmmədquluzadə. *Məscid sərin olduğuna görə, baqqallar oranı icarəyə götürüb, içinə şey yığırdılar.* Çəmənzəminli. **İcarəyə vermək** – müəyyən şərtlərlə başqasına müvəqqəti istifadəyə vermək. [Həsən:] *Sənə yataq icarəyə verən də başını daşın yekəsinə döyüb.* Ə.Haqverdiyev. [Salamov:] *O yer mənim babamın xırman yeridir, xəzinənin nə ixtiyarı var mənim yerimi icarəyə versin?* C.Cabbarlı. *Bəy o il torpağını icarəyə verməkdən boyun qaçırdı.* M.Hüseyn.

**İCARƏÇİ** b a x **icarədar.**

**İCARƏDAR** *is.* [*ər.* icarə və *fars.* ...dar] Birinin mülkünü və s.-ni icarəyə götürən adam. *Kişi də hacının yuxarı baş karvansarasının icarədarıdır.* P.Makulu.

**İCARƏDARLIQ** *is.* İcarəyə götürmə, kirə etmə.

**İCARƏLƏMƏ** "İcarələmək"dən *f.is.*

**İCARƏLƏMƏK** *f.* İcarəyə götürmək, kirələmək. *Torpaq icarələmək.*

**İCARƏLƏNMƏ** "İcarələnmək"dən *f.is.*

**İCARƏLƏNMƏK** *məch.* İcarəyə (kirəyə) götürülmək; kirələnmək. *Torpaq icarələnib.*

**İCARƏNAMƏ** *is.* [*ər.* icarə və *fars.* ...namə] İcarəyə almaq və ya vermək haqqında yazılı sənəd; icarə kağızı.

**İCAZƏ** *is.* [*ər.*] 1. İzin, rüsxət, ixtiyar. *İcazə almaq. İcazə istəmək. İcazə vermək. – Kargüzar qardaşına toy eləmək üçün icazə alıb, kəndə getmişdi.* S.Rəhman.

2. İcazənamə, icazə vərəqəsi. *İcazənizi göstərin.*

**İCAZƏLİ** *sif.* İcazə verilmiş, rüsxət verilmiş, icazə almış, bir şeyi etməyə icazəsi olan.

**İCAZƏNAMƏ** *is.* [*ər.* icazə və *fars.* ...namə] Bir yerə daxil olmaq və ya bir iş üçün verilən icazə vərəqəsi; rüsxətnamə. *Bütün müxbirlərin icazənamələri bir yerdə imzalanıb.* Ə.Məmmədxanlı.

**İCAZƏSİZ** *zərf* İzinsiz, rüsxətsiz, icazə olmadan, icazə almadan. *İcazəsiz danışmaq. İcazəsiz getmək. İcazəsiz götürmək. – Əminə ərindən icazəsiz qızıl verib, iki nəfərin dəvəsini almış*(*dı*). Ə.Əbülhəsən.

**İCAZƏT** *klas.* bax **icazə** 1-ci mənada. ◻ **İcazət olunmaq** – icazə verilmək, izin verilmək. *Şah buyurdu ki, .. bu məclisi-xasdır, ona binaən mənim tərəfimdən icazət olunur ki, oturasınız.* M.F.Axundzadə. *Divan-dərəni bəndə çəkib aldı dübarə; Bu bidət olan əmrə icazət uçitellər.* M.Ə.Sabir.

**İCBAR** *is.* [*ər.*] Cəbr etmə, məcbur etmə; öz razılığı, arzusu olmadan bir işə sövq etmə. ◻ **İcbar etmək** – məcbur etmək.

**İCBARİ** *sif.* Məcburi. *Ümumi icbari təhsil.* // İstəməyərək, güclə.

**İCBARİLİK** *is.* Məcburilik.

**İCLAS** *is.* [*ər.*] Bir məsələni müzakirə etmək üçün hər hansı bir təşkilat üzvlərinin bir yerə yığılması; yığıncaq. *Fəallar iclası. Valideynlər iclası. İclas salonu. – O günün sabahı iclasdan əvvəl qurultay binasında təşkil edilmiş .. sərgini gəzərkən Eldar* [Ceyrana] *yaxınlaşır.* S.Hüseyn. [Nuriyyə:] *Nazxanımı çağırıb, zalı iclas üçün hazırlamağı tapşırdım.* İ.Əfəndiyev. ◻ **İclas etmək** – bir məsələni müzakirə etmək üçün yığışmaq. *İyulun birinci yarısında məclis iclas etdiyi zaman bir avtomaşın siqnal verməyə başlayır.* M.İbrahimov.

**İCLASÇI** *is.* Məhkəmə iclasında iştirak edən xalq nümayəndəsi.

**İCLASÇILIQ** *is.* İclasçı işi, iclasçı vəzifəsi.

**İCLASBAZ** *is.* [*ər.* iclas və *fars.* ...baz] İclası, iclas etməyi çox sevən adam (mənfi mənada işlənir).

**İCLASBAZLIQ** *is.* Çox iclas çağırma, çox iclas etmə; iclas etməyi, çox iclasa getməyi sevmə (mənfi mənada işlənir).

**İCMA** *is.* [*ər.*] 1. Qədimdə: hər hansı bir ərazi daxilində yaşayan əhalinin özünüidarə hüququna malik birliyi, təşkilatı. *Şəhər icması. Qədim Rusiyada kəndli icması.*

2. *köhn.* Cəmiyyət, təşkilat, məclis, ittifaq. *Dini icma. – Sənət isə ibarət idi alinəsəb, dövlətmənd, ağıllı və insaflı əşxasın icmasından.* F.Köçərli. *1915-ci ildən başlayaraq müharibə əleyhinə bir çox icmalarımız oldu.* T.Ş.Simurq. ◻ **İcma etmək** *köhn.* – bir yerə toplaşmaq, bir məsələni müzakirə etmək üçün yığılmaq, iclas etmək. // *köhn.* Camaat. [Komediya] *..icmanın bir o qədər xoşuna gəldi ki, pərdənin axırında "afərin" sədası göyə çıxıb, üç-dörd dəfə pərdənin qalxmağını .. əl çalıb tələb edirdilər.* F.Köçərli.

◊ **İbtidai icma quruluşu** – insan cəmiyyətinin ilk ictimai-iqtisadi quruluş forması.

**İCMAL** *is.* [*ər.*] 1. Qısa məlumat, bir məsələnin ümumi şəkildə qısaca şərhi; xülasə. ◻ **İcmal vermək** – xülasə etmək. *Təfsili-qəminə verdi icmal; Qıldı ona ərzi-surəti-hal.* Füzuli.

2. Qəzetlərdə günün siyasi hadisələrini ümumi şəkildə xülasə edən məqalə, yazı. *Qəzetdə dünya hadisələrinə dair icmal vardır.*

**İCMALÇI** *is.* İcmal yazan jurnalist, icmal müəllifi (bax **icmal** 2-ci mənada).

**İCMALƏN** *zərf* [*ər.*] *köhn.* Qısaca, müxtəsər, xülasə şəklində.

**İCRA** *is.* [*ər.*] Bir işin, qərarın, hökmün və s.-nin yerinə yetirilməsi, həyata keçirilməsi. *İcranı yoxlamaq. Göstərişin icrasına çalışmaq. –* [Yusif şah] *naçar ümuri-səltənətin icrasına iqdam etdi.* M.F.Axundzadə. *Balacayev bu gün Gülöyşə vasitəsilə Rüxsarəyə tapşırıq verməyi və sonra da belə bir şahidin iştirakı ilə icrasını yoxlamağı qərara almışdı.* S.Rəhimov. ◻ **İcra etmək** – yerinə yetirmək, həyata keçirmək, əməl etmək. [Dursun] *öhdəsinə mühəvvəl olan işləri qeyrətlə icra edirdi.* A.Şaiq. *İstər arvadı Nigar, istər çocuqları* [Muradın] *bütün əmr və tələblərini düşünmədən icra edər, onun sözündən çıxmazdılar.* S.Hüseyn.

◊ **İcra vərəqəsi** *hüq.* – məhkəmənin hökmünü və ya qərarını həyata keçirmək üçün sənəd.

**İCRAÇI** *is.* 1. Bir qərarı, hökmü, əmri, göstərişi icra edən, əməli surətdə yerinə yetirən, həyata keçirən adam. *Hüsaməddin kimi adamlar onun fikrinin icraçılarıdır.* M.S.Or-

dubadi. // Sif. mənasında. [Yunis] *əvvəl icraçı mühəndis, ..sonra trestin baş mühəndis müavini vəzifəsində işləmişdi.* Mir Cəlal.

2. Bədii (musiqi, ədəbi və s.) əsərin ifaçısı. [Rəşid] *ümumittifaq özfəaliyyət icraçıları baxışında birincilik qazanmışdır.* M.Rzaquluzadə.

◊ **Məhkəmə icraçısı** – icra vərəqəsinə əsasən məhkəmə qərarını həyata keçirən məhkəmə işçisi.

**İCRAEDİCİ** b a x **icraçı**. *İcraedici orqanlar.*

**İCRAİYYƏ: icraiyyə komitəsi** – hökumət qərarlarını həyata keçirmək, bir şeyi əməli surətdə idarə etmək vəzifəsini həyata keçirən orqanların adı. *Rüstəm kişi .. rayon icraiyyə komitəsi sədrinin yanına getməyi qərara aldı.* M.İbrahimov. *İcraiyyə komitəsinin binası qarşısında durmuş iki minik maşını qardan seçilmirdi.* Q.İlkin.

**İCRAKOM** *is.* [*ər.* icra və *fr.* comite] İcraiyyə komitəsinin qısaldılmış adı. *İcrakomun sədr müavini qırmızı karandaşı naxışlı qələmdandan çəkib, vacib görkəm aldı.* B.Bayramov.

**İCRASIZ** *sif.* və *zərf* Yerinə yetirilməmiş, əməl edilməmiş, həyata keçirilməmiş. *Evdə uşaq heç bir rejimə tabe olmadan yaşayarsa, məktəbin verdiyi tapşırıqlar da icrasız qalar.* "Az. qad."

**İCRƏT** *is.* [*ər.*] *köhn.* 1. Görülən iş üçün verilən haqq (pul), muzd (maaş), zəhmət haqqı. [Hacı Rəcəbəli:] *Ağa Mərdan, uşaqların icrətini məlum elə!* M.F.Axundzadə. *Vəliquluya və Zibaya Xudayar bəy o qədər icrət təyin elədi ki, Zeynəb acından ölməsin..* C.Məmmədquluzadə.

2. **İcrətlə** şəklində *zərf* – görülən iş üçün zəhmət haqqı alaraq; muzdla, maaşla, pulla. *İcrətlə işləmək. – Sabahı günü üç nəfər adam icrətlə tutub qəzalara göndərdi ki, Haqq Mövcudun ölüsünü, ya dirisini tapıb gətirsinlər.* Ə.Haqverdiyev. *Gülzar bəzən qonşuları üçün icrətlə çalışırdı.* C.Cabbarlı.

**İCTİHAD** *is.* [*ər.*] *klas.* 1. Cidd-cəhd, var gücü ilə çalışma, səy etmə, çalışıb-çapalama. □ **İctihad etmək** *köhn.* – gücü çatdıqca çalışmaq, səy etmək, əlləşmək. *..Elə güman eliyirdim ki, bunların içində yenə heç olmasa minlərcə tapılar ki, elm, fənn və maarif aləmində ictihad edib hər biri öz milləti və vətəninin iftixarına bais olublar.* C.Məmmədquluzadə. *Yaxud, de görüm, müdiri- "Kəşkül"; Ünsizadə Səidi-məqul; Etdikləri ictihadə nisbət; Millətdən alır bu gün də qiymət.* M.Ə.Sabir.

2. *din.* Müctəhidin əhkam və hadisələrdən məna, hökm çıxarması və çıxardığı məna. [Molla Bağır:] *Məsələn, onun əqidəsi ilə guya ictihad lazım deyil və xüms və imammalı vermək xilafdır və guya üləma fövt olan müctəhidin rəyində qalmağı o cəhətdən avama caiz görmürlər ki, özlərinin bazarı rəvac olsun.* M.F.Axundzadə.

**İCTİMAİ** *sif.* [*ər.*] 1. İnsan cəmiyyətinə aid olan. *İctimai quruluş. İctimai inkişaf qanunları.* // Cəmiyyətdə insanların həyat və münasibəti ilə bağlı olan, cəmiyyətdə cərəyan edən, cəmiyyətdə törəyən, cəmiyyətin həyatına aid olan. *İctimai həyat. İctimai sığorta. İctimai münasibətlər. İctimai mənafe. İctimai tərəqqi. İctimai vəziyyət. – Bunların hamısını nəzərə alıb, biz bir neçə Badkubə müəllimləri açıq və sadə dil ilə yazılmış tərbiyə və təlim üsulundan, ədəbiyyatdan və ictimai məişətdən bəhs edən aylıq bir jurnal nəşr etməyə şüru etdik.* C.Məmmədquluzadə. *"Molla Nəsrəddin" çürümüş, köhnə, yaramaz .. həyat və ictimai əlaqələrin hərtərəfli və öldürücü tənqidçisidir.* M.İbrahimov. // Cəmiyyətin siniflərə, qruplara bölünməsi ilə əlaqədar olan. *Əhalinin ictimai tərkibi. İctimai mənşə. İctimai qruplar. İctimai ziddiyyətlər.*

2. Kollektivin siyasi, mədəni, həmkarlıq və s. ehtiyaclarına könüllü xidmətlə bağlı olan. *İctimai iş. İctimai vəzifə. İctimai təşkilatlar. İctimai tapşırıq.*

3. Hamıya, bütün cəmiyyətə məxsus olan; kollektiv, ümumi, ellik. *İctimai gəlir. İctimai mülkiyyət. –* [Ziba] *hər zaman Əsmərin halına acıyar, onu özü ilə .. ictimai yerlərə çəkməyə çalışardı.* S.Hüseyn.

**İCTİMAİLƏŞDİRİLMƏ** "İctimailəşdirilmək"dən *f.is. İstehsal vasitələrinin ictimailəşdirilməsi. Torpağın ictimailəşdirilməsi.*

**İCTİMAİLƏŞDİRİLMƏK** *məch.* Fərdilikdən, xüsusilikdən çıxarılıb, cəmiyyətin,

kollektivin ixtiyarına verilmək; ümumiləşdirilmək, elliklәşdirilmək.

**İCTİMAİLƏŞDİRİLMİŞ** *f.sif.* Fərdilikdən, xüsusilikdən çıxarılıb, cəmiyyətin, kollektivin ixtiyarına verilmiş; ümumiləşdirilmiş, ellikləşdirilmiş. *İctimailəşdirilmiş təsərrüfatlar. İctimailəşdirilmiş torpaqlar.*

**İCTİMAİLƏŞDİRMƏ** "İctimailəşdirmək"dən *f.is.*

**İCTİMAİLƏŞDİRMƏK** *f.* Dağınıq, fərdi, xüsusi təsərrüfatı, istehsal vasitələrini, təsərrüfat obyektlərini və s.-ni ictimai kollektiv, təsərrüfat halına gətirmək; ümumiləşdirmək, ellikləşdirmək. *İstehsal alət və vasitələrini ictimailəşdirmək. Torpağı ictimailəşdirmək.*

**İCTİMAİLƏŞMƏ** "İctimailəşmək"dən *f.is.*

**İCTİMAİLƏŞMƏK** *f.* Fərdilikdən, xüsusilikdən çıxıb ümumiləşmək, cəmiyyətin mülkiyyətinə keçmək, ellikləşmək.

**İCTİMAİLİK** *is.* İctimai xarakterdə olma; ümumilik, kollektivlik.

**İCTİMAİYYAT** *is.* [*ər.*] Cəmiyyət və onun inkişafından bəhs edən elm. *İctimaiyyat dərsi. İctimaiyyat müəllimi. – İctimaiyyat dərnəyi rəhbəri* [Ənisənin] *.. müraciətini çox soyuq qarşılamışdı.* S.Hüseyn.

**İCTİMAİYYƏT** *is.* [*ər.*] Cəmiyyətin qabaqcıl dairələri, qabaqcıl hissəsi. *Elmi ictimaiyyət. İctimaiyyətin fikri. İctimaiyyətin diqqətini cəlb etmək.* // Ümumiyyətlə, cəmiyyət. *Demək, bu məsələ əxlaq və ictimaiyyət ilə əlaqədardır.* A.Şaiq.

**İCTİMAİYYƏTÇİ** *is.* İctimai işlərdə, ictimai həyatda fəal iştirak edən adam. // Sif. mənasında. *İctimaiyyətçi qadınlar.* – [Səmayə] *özü bir yaxşı ictimaiyyətçi qızdı, Heydərov onu al dillə aldadıb yoldan çıxartmışdır.* Mir Cəlal.

**İCTİNAB** *is.* [*ər.*] *klas.* Çəkinmə, saqınma, uzaqlaşma, uzaq durma. *Fürsəti fövt etmək olmaz, gözləyir əğyarlar; Onların bədgularından ictinabın vaxtıdır.* Aşıq Qurban. *A kişi, mənim bu Gəncə şəhərində bir rəfiqim var, .. adını qoyub müəllim, heç bir zaddan ictinabı yox.* "Mol. Nəsr." [Sitarə:] *Naməhrəmə üzümü göstərməkdən ictinabə məcburəm.* C.Cabbarlı. ◻ **İctinab etmək (qılmaq)** – çəkinmək, saqınmaq, uzaq durmaq. *Dersən ki, xublərdən kəs mehrin, ictinab et; Yaxşılar ilə, zahid, yaxşımıdır yamanlıq?* Qövsi. *Hər nə etsən, et və lakin etmə meydən ictinab...* M.Ə.Sabir.

**İCZ** *klas.* b a x **əcz**. *Tənha qalıb etdi naleyi-zar; Dərdü qəmə qıldı iczin izhar.* Füzuli. *Ətalət mayeyi-iczü kədərdir.* M.Ə.Sabir. *Ey milləti cəhalətə vadar edən axund; Hər dürlü fəqrü iczə giriftar edən axund!* Ə.Qəmküsar.

**İÇ** *is.* 1. Bir şeyin içərisi, daxili, iç tərəfi. *Əvvəl evin içi, sonra çölü.* (Ata. sözü). *Mağaranın içi yumşaq ağac qabıqları ilə döşənmişdi.* A.Şaiq. *Əşrəf yavaşcadan sürünüb kola yaxınlaşdı, əli ilə kolun içini yoxladı.* S.Rəhman. // Bir şeyin ortası, arası. *Otların içində uzanmaq.* – [Məşədi İbad:] *Sən kimi bir gözəli; Bağın içində görəsən.* Ü.Hacıbəyov. // Qapalı, örtülü, ya oyuq olan şeylərin boşluğu. *Qutunun içi. Tabağın içi.*

2. İnsan və heyvanların döş və qarın boşluğunda yerləşən üzvlər; içalat. *Musa kişi toğlunun içini təzəcə çıxarıb, Gülnazın əlindəki mis qaba qoymuşdu ki, həyət qapısı döyüldü.* M.İbrahimov. ◻ **İç qovurması** – cızbız. *İçə qonaq eləmək.* **İç yağı** – bağırsaqları örtən piy təbəqəsi.

3. Məğz, ləpə, özək (qabıqlı meyvələrdə). *Badam içi. İçi çürük qoz.*

4. *məc.* Bir şeyin daxili və gizli, görünməz cəhəti; batin. *İçim özümü yandırır, çölüm özgəni.* (Məsəl).

5. **İçdən, içindən** şəklində *zərf* – könüldən, ürəkdən, səmimi-qəlbdən. *İçdən gələn sözlər. İçdən arzu etmək. – Anası guya şikayət edər kimi oğlunun saydığı bu sifətlərinə içindən sevinir, fərəhlənir, bir parça da lovğalanırdı.* Qantəmir.

6. **İçində** şəklində *zərf* – 1) daxilində, içərisində. *Evin içində. Quyunun içində. Hovuzun içində. – İnsan nəfəs alanda onun ağzından və burnundan çıxan hava bədənin içində xarab olmuş havadır.* H.Zərdabi; 2) ...ərzində, ...zərfində, ...müddətində, ...içərisində. *Bir qız gördüm biçində; Sarı sünbül içində; Burda bir toy olacaq; Gələn ayın içində.* (Bayatı). *Bir neçə il bundan əqdəm Danabaş kəndində bir uşaq məktəbə gedən günün sabahısı uşağın atasının yeddi qoyunu bir gecənin içində çərləyib ölür.*

C.Məmmədquluzadə. [Cahanın] *qoçaqlığını ondan bil ki, bu yaşında üç-dörd ayın içində savadlandı.* Ə.Haqverdiyev; *Düşünürəm: – Nə qazandım; Otuz yeddi il içində?* B.Vahabzadə; 3) ...arasında, ...içərisində, ...sırasında. *Vaqif səni sevdi xublar içində; Bir təzə qönçəsən gülzar içində.* M.P.Vaqif. [Mərcan bəy:] *Mənim təzə arvadım hələ üzün mənə göstərməyibdir və söz veribdir ki, qonaqların içində üzünü mənə göstərsin.* Ü.Hacıbəyov. *Kamal da bu gənc modelçilər içində idi.* M.Rzaquluzadə; 4) bir şeyin çoxluğunu, artıqlığını, yaxud hansı vəziyyətdə baş verdiyini bildirir. *Qızdırma içində sayıqlamaq. Tər içində olmaq. – Ehtiyac içində böyütdü onu; Böyütdü atalı, yetim oğlunu.* B.Vahabzadə. *Həyətdə hər şey nur içində üzürdü.* Ə.Vəliyev. // **...içinə** şəklində – ...arasına, ...içərisinə. *Nəçərnik öz qonaqları ilə çıxdı camaatın içinə.* C.Məmmədquluzadə. **...içindən** şəklində – ...ortasından, ...arasından. *Maşın kəndin içindən keçdi.* // **İçimizdə** şəklində – aramızda, sıramızda. *İçimizdə pis adam yoxdur.*

7. *sif.* İçəridəki, daxili. *İç qapı. İç qabıq.* ☐ **İç qala** – böyük qalanın içindəki kiçik qala; qalaça, ərk.

◊ **İç üzü** – bir şəxsin hələ heç kəsə məlum olmayan siması, xüsusiyyəti, mahiyyəti və s. keyfiyyəti. *İç üzünü açmaq. İç üzünü bilmək. – Məşədi Kazım ağa isə öz məqsədini bildirmək və özünün iç üzünü açmaq istəmirdi.* M.S.Ordubadi. // Bir şeyin həqiqi mahiyyəti, batini, gözə görünməyən daxili cəhəti, halı. [Səyavuş:] *Heç yalan deyilmiş anamın sözü; Başqa imiş sarayların iç üzü.* H.Cavid. [Nadir] *sanki ayla danışıb, bütün bu sirlərin iç üzünü ondan bilmək istəyirdi.* B.Talıblı. **İçi getmək** – çox arzu etmək, son dərəcə istəmək, can atmaq, bir şeyin həsrətində olmaq. **İçi gülmək** – ürəyində şad olmaq, məmnun olmaq, candan sevinmək, hiss etdirmədən sevinmək. *Ağsaqqallardan biri: – Kərbəlayı, bizim də məqsədimiz elə sənsən. Yoxsa Safo azaylansa da, bu qohumluqdan içi gülür.* S.Rəhimov. **İçi içini kəsmək** – b a x **içi içini yemək**. [Hacı Əhməd:] *..Dünən camaat o qərarı çıxaranda mənim içim içimi kəsirdi.* C.Cabbarlı. **İçi içini yemək** – arzusunu yerinə yetirə bilmədiyi üçün çox üzülmək, həyəcan və iztirab keçirmək. **İçi qan ağlamaq** – halını büruzə vermədiyi halda, çox həyəcan və iztirab keçirmək. **İçi üzülmək** – aclıqdan üzülmək, əldən düşmək. *Saat yeddiyə işləyirdi, lap içim üzülmüşdü.* Mir Cəlal. **İçindən qovrulmaq (qırıla-qırıla qalmaq)** – acığını, hirsini və ya başqa bir hissini üzə verə bilmədiyi üçün çox əzab və iztirab keçirmək. *Qumrunun mərmər kimi ağ vücudunu gördükcə atlı içindən qovrulur.* Mir Cəlal. *Zeynal bəy içindən qırıla-qırıla qaldı.* M.Hüseyn. **İçini arıtlamaq (arıtmaq)** – b a x **boğazını arıtlamaq** ("boğaz[1]"da). *Bu vaxt molla Qafar içini arıtlaya-arıtlaya* (z.) *daxil oldu.* S.Rəhimov. *Bekar arvad ilə qabaq-qabağa oturub yeyir, içini arıdıb deyirdi: – Ye getsin, ay çörəkçi qızı!* Mir Cəlal. **İçini çəkmək** – 1) dərindən nəfəs almaq, köks ötürmək. *Qız dərindən içini çəkərək düşünməyə başladı.* A.Şaiq; 2) həyəcanını, iztirabını, heyrətini dərin bir nəfəs çəkərək, büruzə vermək. *Məsmə heyrətlə içini çəkdi: – Bu nə deyir, lap küfr danışır, Mirzə qardaş!* Mir Cəlal. [Səməd] *gəlinin qəfildən necə diksindiyini, hətta heyrətlə içini çəkdiyini hiss etdisə də, buna məna vermədi.* İ.Hüseynov; 3) hıçqırıb ağlamaq. *Mülayim xala içini çəkib ağladı.* S.Rəhimov. *Əminə ufuldaya-ufuldaya bir az susub durdu, sonra birdən içini çəkib, ağlamağa başladı.* Ə.Əbülhəsən. **İçini gəmirmək** – b a x **içini yemək** 1-ci mənada. *İntiqam hissi canavar kimi Gəldiyevin içini gəmirirdi.* Mir Cəlal. **İçini yemək** – 1) acıq çəkmək, dərd çəkmək; dərd, qəm, qüssə içində qovrulmaq. *Qadın bu dərd ilə içini yedi; Bir axşam varlığa əlvida dedi.* S.Vurğun. *Sərhəng Səfai isə gözünü mütəmadiyən baxışmaqda olan Şəmsiyyə və Şahpurdan çəkə bilmir və içini yeyirdi.* M.İbrahimov; 2) çox qalmaqdan, ya da çox dəyməkdən içi boşalmaq (qarpız haqqında).

**İÇALAT** b a x **iç** 2-ci mənada. *Qoyunun içalatı. –* [Canavar] *yazığın içini, içalatını elə aparmışdı ki, quruca qəfəsəsi qalmışdı.* S.Rəhimov. *Məşədi Şərif içalatı iri bir səbətə qoyub həyətə salladı.* Ə.Vəliyev.

**İÇDİRİLMƏ** "İçdirilmək"dən *f.is.*

**İÇDİRİLMƏK** *icb.* İçməyə məcbur edilmək.

**İÇDİRMƏ** "İçdirmək"dən *f.is.*

**İÇDİRMƏK** b a x **içirtmək**.

**İÇƏİÇ** *zərf dan.* Ara vermədən, dalbadal içmə (çoxları).

**İÇƏRİ** 1. *zərf* Daxilə, daxildə. *İçəri itələmək. İçəri gəl. İçəri buraxmaq. – Şah rüsxət verdi, münəccimbaşı çıxmamış Xacə Mübarək içəri girib ərz elədi..* M.F.Axundzadə. [Sara xanım:] *..Gəlib çıxaram, tıqqıldadaram qapını, açarlar, girərəm içəri..* Qantəmir. *Hənifə qazanı içəri gətirib yerə qoydu, ətəyi ilə sininin üstünə tökülmüş külü sildi.* İ.Hüseynov.

2. B a x **iç** 1-ci mənada. *Evin içəri otaqlarının birisində* (*əndərunda*) *Rəna ilə anası yaşayırdı..* E.Sultanov.

3. İsmin yönlük, yerlik, çıxışlıq hal şəkilçiləri ilə – 1) arasına, arasında, arasından. *Meşənin içərisinə getmək. Uşaqların içərisində biri çox zirəkdir. Kitabların içərisindən ancaq birini seçdim. – ..Bu iki çiçək bu ailələr içərisinə girməklə, onlarda bir yenilik, şadlıq əmələ gətirdisə də, digər tərəfdən, nifaqa və ondan törəyən faciəli hadisələrə də səbəb oldu.* S.S.Axundov. *Sən qoçaqlar içində qoçaqsan gözlərimdə; Ürəyi alov dolu bir dağsan gözlərimdə.* S.Rüstəm. *Kimsəsizlər içərisində .. bu qocanın da siması .. canlanırdı.* Ə.Məmmədxanlı; 2) ərzində, müddətində, zərfində. *Dörd-beş aylıq bir zaman içərisində onunla belə üz-üzə gəlmədiyim birinci kərə vaqe olurdu.* S.Hüseyn.

◊ **İçəri atmaq** *dan.* – birdən içmək, başına çəkmək. *Mirzə Kəmtər də, sanki müsahibindən geri qalmamaq üçün, stəkanında qalan arağı içəri atdı..* Mir Cəlal. **İçəri salmaq** *məc.* – mənimsəmək. **İçəridən qovrulmaq** – ürəyində bərk hirslənmək, acığından qovrulmaq. [Məhbusi] *mister Tomasın hədələrini, qaş-qabağını yadına salır, içəridən qovrulurdu.* M.İbrahimov. **İçəri(yə) ötürmək** – 1) yemək, udmaq. [Əmiraslan baba] *.. ağ lavaşı yarı bölərək, arasını balla doldurdu və bir göz qırpımında nər kimi içəriyə ötürdü.* S.Rəhimov; 2) b a x **içəri salmaq**.

**İÇHAİÇ** *zərf* Bir başdan içmə, ara vermədən içmə, çoxlu içmə; içəiç (çoxları haqqında). *İçhaiç başlandı.*

**İÇİBOŞ** *sif.* İçərisi boş olan, içində heç bir şey olmayan; oyuq. *İçiboş gövdə. İçiboş buynuz.*

**İÇİCİ** b a x **içkiçi**.

**İÇ-İÇALAT** b a x **içalat**. [Mürşüdoğlu] *qoca əli ilə iç-içalatı söküb çıxardıb qanlı biləklərini yudu.* S.Rəhimov.

**İÇİLMƏ** "İçilmək"dən *f.is.*

**İÇİLMƏK** "İçmək"dən *məch. Xörəyin üstündən çay içildi. Qabdakı su içilib qurtarmışdı.* – [Kərəm:] *Qəribin boynuna kəfən biçilməz; Əcəl camı çox acıdı, içilməz!* "Əsli və Kərəm". *Nə qədər şirindir bu ləziz nemət! Şərbət tək içilir bu yolda qəm də.* S.Vurğun.

**İÇİM** Adətən "bir" sözü ilə – bir dəfə içməyə kifayət edəcək qədər. *Bir içim şərab.* – [Ahıl qadın:] *Evdə bir içim su yoxdur.* Ə.Haqverdiyev. *Tapılmır bir içim su evdə, insaf eylə, az sərf et.* M.Möcüz. *Yusif bir içim su üçün gəldiyi evlə də maraqlanmaya bilməzdi.* Mir Cəlal.

**İÇİMLİK** *is.* 1. İçməyə yararlı, içmək üçün olan, içməli. *İçimlik su.*

2. Saylarla miqdar bildirir. *Bir içimlik su. İki içimlik şərab.*

**İÇİN-İÇİN** *zərf* 1. Gizlin, heç kəsə hiss etdirmədən; içində, ürəyində, qəlbində. *Fərhad özlüyündə bu sözlərə için-için gülürdü.* Ə.Vəliyev.

2. Yanıqlı-yanıqlı, yana-yana, acı-acı. *Ağlar da için-için edər ah: – Bu körpəmə sən şəfa ver, Allah!* A.Şaiq. *Həcər isə birdən körpə uşaq kimi için-için hıçqırmağa başladı.* S.Rəhimov. // Ürəyində, başqalarına sezdirmədən, gizli. *Atırvan ordusu pozulmadı və İman qülləsi .. düşmənlərə qarşı için-için kin bəslədi..* Çəmənzəminli. [Durna] *için-için yandığını aydınca hiss etdiyi bu qadındakı səbrə heyrət edirdi.* İ.Əfəndiyev.

**İÇİRDİLMƏ** "İçirdilmək"dən *f.is.*

**İÇİRDİLMƏK** "İçirtmək"dən *məch. Dərman içirdilmək. İçki içirdilmək.*

**İÇİRMƏ** "İçirmək"dən *f.is.*

**İÇİRMƏK** b a x **içirtmək**. *Solğun dodağından cami-sevdanı; İçirmişdir mənə saqiyi-əzəl.* Ə.Cavad.

**İÇİRTDİRMƏ** "İçirtdirmək"dən *f.is.*

**İÇİRTDİRMƏK** *icb.* Başqası vasitəsilə içdirmək, içməyə məcbur etmək.

**İÇİRTMƏ** "İçirtmək"dən *f.is.*

**İÇİRTMƏK** *f.* 1. İçməyə sövq və ya məcbur etmək; içdirmək. *Su içirtmək. – Əzizim, qandı ürək; Yar sözün dandı ürək; Şirin şərbət içirtdin; Nədən bəs yandı ürək?* (Bayatı). *Bir əlində sudur, bir əlində od; Gah verib içirdər, gah yaxar gedər.* Molla Cümə. [Mirzənin] *böyük oğlu təbib bir yanında əyləşib, tez-tez atasının sinəsinə yaş məhrəba salırdı, lazım olduqca dərman içirdirdi.* Ə.Haqverdiyev.

2. İçki verib kefləndirmək, sərxoş etmək; keflənməsinə səbəb olmaq. *Onu kim içirdibdir?*

**İÇKİ** *is.* İçilən spirtli mayelər. *Spirtli içkilər. Şirin içkilər. – Bir müsəlman ki bir rus məclisinə düşərdi, öldürsəydin də, bir qətrə içki dilinə vurmazdı.* C.Məmmədquluzadə. *Axır vaxtlarda Yusif əlinə düşən pulu içkiyə verib, tez-tez məst olurdu.* S.S.Axundov.

**İÇKİÇİ** *sif.* Spirtli içkiləri həddindən artıq içən, içki düşkünü; əyyaş. *Allah, Allah! Kimdi oğru, kimdi oğru saxlayan; Bu pristav içkiçi yerinə culfanı tutar.* Molla Şükür. *Varis böyüdükcə əxlaqsız, içkiçi və qumar düşkünü bir gənc olurdu.* A.Şaiq.

**İÇKİLİ** *sif.* İçki içilən, içki olan. *İçkili məclis. İçkili qonaqlıq.* – [Nəbi:] *Cəbi, bu gecə bizdə böyük qonaqlıq var: oxuyanlı, çalanlı, içkili.* S.S.Axundov.

**İÇKİSİZ** *sif.* Spirtli içkilər olmayan, içilməyən. *İçkisiz məclis.*

**İÇQOVURMASI** *is.* Qoyun içindən hazırlanmış qovurma.

**İÇLİ** *sif.* Astarlı, astarı olan. *İçli yorğan. İçli çul.*

**İÇLİK** *is.* 1. *xüs.* Bir şeyin içərisinə qoyulan, keçirilən, salınan şey.

2. Hər hansı bir şeyin iç tərəfinə tikilən şey; astar. *İçlik keçə. – ..Döyülən keçə qəliblərindən orada tezcə yeni-yeni alaçıqlar düzələr, his bağlamış köhnə alaçıq keçələri isə endirilib, çullara içlik, ya ulaqlara palan salınardı.* S.Rəhimov.

**İÇMƏ** "İçmək"dən *f.is.*

**İÇMƏK** *f.* 1. Maye bir şeyi udmaq. *Su içmək. Dərman içmək. Şərbət içmək. – Yarım saata kimi ağalar və xanımlar çay içməyə və söhbətə məşğul oldular.* C.Məmmədquluzadə. *Stol üstündəki qrafindən stəkana su tökük içdim.* A.Şaiq. // Məc. mənada. *Yar ki yara həsrət ilə qovuşdu; Dodaq busə içər, dil ləzzət çəkər.* Aşıq Ələsgər. *Eşqin çeşməsindən bir damcı içdim; Axdı sellər qədər gözümün yaşı.* B.Vahabzadə.

2. Eyni mənada spirtli içkilər haqqında: sərxoşluq etmək, əyyaşlıq etmək. *Eylədik tövbə, əgər göz görə pünhan içdik.* Qövsi. *Bu sözdən Qaraca qız əsla şad olmadı, çünki bilirdi ki,* [Yusif] *oraya içməyə gedir.* S.S.Axundov. *İçmək Cümşüd bəyi xarab etdi, o qədər içirdi ki, bir saat da sərxoşluqdan ayıq olmurdu.* E.Sultanov. ☐ **Sağlığa (sağlığına) içmək** – birinin şərəfinə badə qaldırmaq. [Əsgər:] *Sağ ol, Məşədi İbad! Sağlığına içirəm.* Ü.Hacıbəyov.

3. Sulanmaq, su verilmək. *Ağaclar su içdi. Torpaq su içdi.* – [İsgəndərzadə:] *Sən də get, arxayın ol, sabah bağın su içər.* Ə.Haqverdiyev.

**İÇMƏLİ** *sif.* İçməyə yararlı; şirin. *İçməli su.* // Tamlı, dadlı. *İçməli şərbətlər. İçməli mədən suları. – Buranın yerindən, havasından əlavə, suyu çox içməlidir.* Ə.Haqverdiyev.

**İÇRƏ** *qoş. köhn. klas.* İçində, içərisində. *Bağ içrə. Ev içrə. – Mən bülbüli-baği-firqətəm, zar; Amma qəfəs içrəyəm giriftar.* Füzuli. *Çoxdur cahan içrə nazənin dilbər; Özümə münasib yarı istərəm.* Qurbani. *Vərəq-vərəq dilü can hicrin içrə odlandı.* X.Natəvan. *Böylə həyat içrə yüzdən çox yaşar; Zəhmətkeş dehqanı bizim dağların.* S.Vurğun.

**İÇSİZ** *sif.* İçi olmayan, içi boş; ləpəsiz. *İçsiz fındıq.* // İçi, astarı olmayan. *İçsiz çul.*

**İDARƏ** *is.* [*ər.*] 1. Hər hansı bir iş (dövləti, elmi, ictimai, ticarət, təsərrüfat və s.) sahəsinə baxan, müəyyən ştatı, müdiriyyəti olan təşkilat. *Dövlət idarələri. Elmi tədqiqat idarəsi. Mərkəzi statistika idarəsi. İctimai idarələr. Sığorta idarəsi. – Mehriban zavod idarəsinin uzun, işıqlı dəhlizi ilə gedib sola döndü.* H.Seyidbəyli. *Rüstəm kişi paltosunun ətəyini yellədə-yellədə özünü maarif idarəsindən çölə atdı.* M.İbrahimov. // Həmin təşkilatın və ya orqanın yerləşdiyi bina. *İdarə saat 9-da açılır. İdarəyə getmək. İdarədə bu gün növbətçi kimdir? – Keçmiş vaxtlarda dəftərxanalarda qulluqçulardan*

*gündə biri idarə bağlandıqdan sonra qalıb, təcili məktubları, teleqramları qəbul edərdi.* Ə.Haqverdiyev. *Ağayar donquldana-donquldana idarədən çıxanda, əvvəl raykoma getmək istədi.* Ə.Əbülhəsən.

2. Rəhbərlik etmə, rəhbərlik, başçılıq. ☐ **İdarə heyəti** – hər hansı bir idarənin, təşkilatın və s.-nin başında duran seçkili orqan. *Azərittifaqın idarə heyəti. – Qulu iki dəfə döşünü qabardıb idarə heyəti adından* [İmi ilə Cimiyə] *irad tutdu.* İ.Əfəndiyev. *Həmin gün Səməd idarə heyətinin iclasını çağırmışdı.* İ.Hüseynov. **İdarə etmək** – 1) rəhbərlik etmək, başçılıq etmək, dolandırmaq. *Dövləti idarə etmək. Ölkəni idarə etmək. Təsərrüfatı idarə etmək.* // Müdirlik etmək, rəislik etmək, bir idarənin başçısı olmaq. *İnstitutu idarə etmək. – Çaparxananı idarə edən Rəhim bəy tamam qəzada "Gödək Rəhim bəy" adı ilə məşhur idi.* Ə.Haqverdiyev. *Toy gecələrini idarə edənə sərpayı deyərdilər.* H.Sarabski; 2) dirijorluq etmək. *Orkestri idarə etmək. Xoru idarə etmək;* 3) hər hansı vasitələrdən, mexanizmlərdən, cihazlardan və s.-dən istifadə edərək, bir şeyin işini, hərəkətini nizama salmaq, müəyyən tərəfə yönəltmək, istiqamətləndirmək. *Parovozu idarə etmək. Avtomatı idarə etmək. Gəmini idarə etmək. Ekskavatoru idarə etmək. – Qazıma zamanı buruğu və qazıma prosesini mütəxəssis qazıma ustası idarə edir.* S.Quliyev; 4) yetmək, çatmaq, kifayət etmək, dolandıra bilmək, ödəmək. *Ailəsini güclə idarə edir. Bu vəsait tələbatı idarə etməyəcək.*

3. Qrammatikada: tabeedici sözün tələbinə görə tabe sözün müəyyən hallara düşüb dəyişməsi. *İdarə əlaqəsi.*

**İDARƏÇİ** 1. *is.* İdarə edən, rəhbərlik edən, müdir.

2. *sif.* Evi yaxşı idarə edən, qənaətçi, qənaətcil, təsərrüfatçı, israfçı olmayan; idarədar. *İdarəçi qadın. – Rəmziyyə onun ruhuna uyğun, idarəçi, həmin gözəl bir qız idi.* A.Şaiq.

**İDARƏÇİLİK** *is.* Rəsmiyyətçilik, quru rəsmiyyət. *Təchizat təşkilatlarının işində də idarəçilik halları çoxdur.* (Qəzetlərdən).

**İDARƏDAR** [*ər.* idarə və *fars.* ...dar] b a x **idarəçi** 2-ci mənada.

**İDARƏDARLIQ** *is. köhn.* 1. Evi yaxşı idarə etmə, qənaətçilik.

2. B a x **idarəçilik.** *O fikirləşirdi: – Bəzi yerlərdə bəzi mühərrirlər kağızpərəstliklə idarədarlığa nədənsə hörmət bəsləmirlər.* Mir Cəlal.

**İDARƏEDƏN** *f.sif. dilç.* İdarə əlaqəsində tabeedici tərəf (söz).

**İDARƏEDİCİ** *is.* 1. İdarə edən, başçılıq edən, rəhbərlik edən, rəhbər. *İdarəedici partiya.*

2. *tex.* İşlədən, hərəkətə gətirən, bir mexanizm və s.-nin hərəkətini, işini nizama salan. *İdarəedici mexanizm. İdarəedici sistem.*

**İDARƏLƏNƏN** b a x **idarəolunan** 1-ci mənada. *İdarələnən qurğu.*

**İDARƏLƏNMƏ** "İdarələnmək"dən *f.is.*

**İDARƏLƏNMƏK** *f.* İdarə edilmək, hərəkəti, işi idarə olunmaq.

**İDARƏLƏRARASI** *is.* Müxtəlif idarələr arasında olan, aparılan, cərəyan edən. *İdarələrarası yazışma.*

**İDARƏLİ** *sif.* 1. İdarə edəni, başçısı olan.

2. B a x **idarəçi** 2-ci mənada.

**İDARƏOLUNAN** *sif.* 1. Hərəkəti, işi idarə oluna bilən. *İdarəolunan raket. İdarəolunan təyyarə. İdarəolunan mərmi.*

2. *qram.* İdarə əlaqəsində tabe tərəf.

**İDARƏSİZ** *sif.* 1. Rəhbəri, başçısı, idarə edəni olmayan. *İdarəsiz ailə.*

2. İsrafcıl, qənaətə riayət etməyən.

**İDBAR** [*ər.*] 1. *sif.* Çirkin, kifir, eybəcər. *Rədd ol qapıdan, ağlama zar-zar, dilənçi; Vaqqıldama bayquş kimi, idbar dilənçi.* M.Ə.Sabir. *Mahmuda atası öləndən sonra yalnız bir bacı qalmış ki, o da indi kifirin və idbarın biridir və heç kəs də onu almaq istəməyir.* B.Talıblı.

2. *is. klas.* Bəxtsizlik, talesizlik, uğursuzluq, düşkünlük, tale dönüklüyü (*iqbal* ziddi). *Getdi başından, könül, ol sərv qəddin sayəsi; Ağla kim, idbarə təbdil oldu iqbalın sənin.* Füzuli. *Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çıraq; Gecəki iqbalı gör, gündüzdəki idbarə bax!* M.P.Vaqif. *Nəql edim bir-bir sənə mən hər yerin əhvalını; Bax, düşün, gör onların idbarını, iqbalını.* Ə.Qəmküsar.

**İDBARLIQ** *is.* Çirkinlik, kifirlik, eybəcərlik.

**İDDƏ(T)** *is.* [*ər.*] *köhn. din.* Ərindən boşanan və ya əri ölən qadının təkrar ərə gedə bilməsi üçün şəriətcə gözləməli olduğu vaxt (100 gün). *Şərəbanının iddəsi tamam olmamışdı, xalamgil getdilər, övrəti gətirdilər, əri Hacı Ramazana tapşırdılar..* C.Məmmədquluzadə. [Kərbəlayı Qubad:] *Bax, sən bu güncə talağını ərindən al, sonra bir üç ay on gün gözlə, iddən çıxsın.* Ü.Hacıbəyov.

**İDDİA** *is.* [*ər.*] 1. Tələb. [Ağamərdan:] *Siz də mənim yerimə razı olub, hakimi-şər yanına adam göndərib bildiribsiniz ki, Hacı Qafur tapşırdığı pulu onun bacısına verməsin ki, onunla iddianız var.* M.F.Axundzadə. □ **İddia etmək (eləmək)** – tələb etmək, istəmək. *..O səbəbə Xudayar bəy Zeynəbi boşamazdı ki, qorxurdu şərir adamların birisi Zeynəbi ala və başlaya Xudayar bəydən səğirlərin mal-mülkünü iddia eliyə.* C.Məmmədquluzadə. *Səfər qardaşının qanını bütün kənddən iddia edirdi.* S.S.Axundov.

2. Haqlı-haqsız bir fikrin üstündə inad etmək, bir şeyi başqalarına da qəbul etdirməyə çalışmaq. *Mirzə Cəlil iddia edirdi ki, Pəri arvadın dili baldan şirin, xasiyyəti çox mülayimdir.* Ə.Vəliyev.

3. Özünə isnad etdiyi bir keyfiyyətin, sifətin başqaları tərəfindən də qəbul və təsdiqinə çalışma, özü haqqında böyük fikirdə olma. *İddiası böyükdür. Böyüklük iddiasında olmaq. Çirkin olduğu halda gözəllik iddiasındadır. İgidlik iddiasında olmaq. – Seyr edib boş iddiadan başqa bir şey görmədim.* H.Cavid. **İddiaya (...iddiasına) düşmək** – ...xəyalına düşmək, xəyalında olmaq, ...xəyalından keçmək, ...iddiasında olmaq. *Firontək iddiayə düşsəm nə əcəb; Çox zövqlidir abü havası Misrin.* S.Ə.Şirvani. *Bu bir Allah vergisidir ki, hər qələm əhlinə nəsib olmaz, hər ədiblik iddiasına düşəni məsud qılmaz.* F.Köçərli. [Nemət kişi:] *Bu cür qəhrəmanlıq iddiasına düşənin yəqin kəlləsi boşdur.* M.Hüseyn.

4. Lovğalıq, təşəxxüs, təkəbbür, özünü yüksək tutma. □ **İddia eləmək (satmaq)** – lovğalanmaq, təşəxxüslənmək. *İddia eləmə, Vahid, quru bir canın var; Onu da sən gərək öz yarına qurban edəsən.* Ə.Vahid.

◊ **İddiası yerə-göyə sığmamaq** – çox lovğa, təşəxxüslü, özü barəsində çox böyük fikirdə olan adam haqqında. [Salmanın] *ağardığını, əl-ayağa düşdüyünü görən Şirzad düşündü: iddiası yerə-göyə sığmırsa da, özü yaman qorxaqdır.* M.İbrahimov.

**İDDİAÇI** *is.* 1. Birindən iddiası olan, bir şeyi istəməyə, tələb etməyə əsası olan adam.

2. Böyük iddiası olan adam, özü haqqında böyük fikirdə olub, bunun başqaları tərəfindən də qəbul edilməsinə çalışan adam.

**İDDİALANMA** "İddialanmaq"dan *f.is.*

**İDDİALANMAQ** *f.* Təşəxxüslənmək, özünə güvənmək, lovğalanmaq.

**İDDİALI** *sif.* Özü haqqında böyük fikirdə olan, təkəbbürlü, təşəxxüslü, özünə çox güvənən, lovğa. *İddialı adam. İddialı oğlandır. – Nə soxulmusan araya, a başı bəlalı fələ? Nə xəyal ilə olubsan belə iddialı, fələ?!* M.Ə.Sabir. *Naqis olsa belə əqli, kamalı; Onu görərsiniz çox iddialı.* S.Rüstəm.

**İDDİALILIQ** *is.* Özü haqqında böyük fikirdə olma; mütəkəbbirlik, təşəxxüslük, lovğalıq, özünə çox güvənmə.

**İDDİASIZ** *sif.* 1. Heç bir iddiası, tələbi olmayan. *İddiasız qız. – Qaraş üzüyola, başıaşağı, söz qaytarmayan, həlim xasiyyətli idi. Belə adama gərək özü kimi yumşaq və iddiasız arvad tapasan.* M.İbrahimov.

2. Sadə, təkəbbürsüz, təvazökar. *İddiasız adam.*

**İDDİASIZLIQ** *is.* 1. İddiası, tələbi olmama.

2. Sadəlik, təkəbbürsüzlük, təvazökarlıq.

**İDEÁL** *is.* [*fr.*] 1. Ən yüksək məqsəd; qayə, amal. *Yüksək ideallar uğrunda mübarizə. – Yazıçının yüksək idealı işıqlı bir ulduz kimi bizi irəliyə səsləyir.* M.Arif. [Kərim xan Xavərə:] *Mənim idealım gələcək gündür, biz o günə çatacağıq.* M.İbrahimov. [Hüseyn:] *..Səhnə mənim məqsədim, idealım və qəlbimdir.* S.Rəhman.

2. Bir şeyin ən gözəl, ən yaxşı, ən mükəmməl nümunəsi. *İndi Bakı* [gənclər] *üçün işıq və bilik mənbəyi olmuşdur, hamısı buraya ideal kimi baxır.* M.Hüseyn.

**İDEALÍST** *is.* [*fr.*] 1. İdealist fəlsəfə tərəfdarı. *İdealist sistemlər. Fəlsəfə tarixində obyektiv idealist təlimlər ilk əvvəl Şərqdə meydana gəlmişdir.*

2. Həqiqəti ideallaşdıran, malik olmadığı sifətləri ona isnad edən adam: xəyalpərəst.

3. İdealizmə aid olan, idealizm mahiyyətində olan. *İdealist fəlsəfə. İdealist görüşlər.*

**İDEALİSTCƏSİNƏ** *zərf* İdealist nəzəriyyə əsasında, idealist kimi, idealistə xas bir şəkildə. *Məsələni idealistcəsinə izah etmək.*

**İDEALİSTLİK** *is.* İdealizm mahiyyətində olma, idealizmə aid olma, idealist ruhda olma; xəyalpərvərlik, xülyaçılıq.

**İDEALİZƏ** [*fr.*]: **idealizə etmək** – bir şeyi, həqiqətdə olduğundan daha yaxşı bir şəkildə təsvir etmək, göstərmək; əsassız yerə şişirtmək, tərifləmək, ideal bir şey kimi qələmə vermək; ideallaşdırmaq. *Axundov nəinki çarizmə, hətta müəyyən dərəcədə idealizə etdiyi Qərb tərəqqisinə, burjua cəmiyyətinə də gözüyumulu yanaşmır.* M.İbrahimov.

**İDEALÍZM** *is.* [*fr.* əsli *yun.*] 1. Ruhi olanın, qeyri-maddinin birinciliyi və maddi olanın ikinciliyi prinsiplərindən çıxış edən fəlsəfi cərəyan. *Obyektiv idealizm. Dialektik idealizm. Qədim dövr idealizmi. İdealizm şüuru təbiətdən təcrid edilmiş şəkildə nəzərdən keçirir.*

2. Həqiqəti idealizə etmə, ideallaşdırma.

**İDEALLAŞDIRILMA** "İdeallaşdırılmaq"-dan *f.is.*

**İDEALLAŞDIRILMAQ** *məch.* İdealizə edilmək (b a x **idealizə**).

**İDEALLAŞDIRMA** "İdeallaşdırmaq"dan *f.is.*

**İDEALLAŞDIRMAQ** *f.* İdealizə etmək (b a x **idealizə**).

**İDENTÍK** *sif.* [*lat.*] Eyni, birmənalı.

**İDEOQRAFİK** *sif. dilç.* İdeoqrafiyaya əsaslanan, ideoqrafiyaya aid olan. *İdeoqrafik yazı.*

**İDEOQRÁFİYA** [*yun.*] *dilç.* İdeoqramlar vasitəsilə yazı.

**İDEOQRÁM** [*yun.*] *dilç.* Bu və ya digər dildə səsləri deyil, bütöv məfhumu ifadə edən şərti yazı işarəsi.

**İDEOLÓGİYA** *is.* [*yun.*] İctimai şüurun müxtəlif formalarında – fəlsəfədə, siyasətdə, hüquqda, əxlaqda, incəsənətdə, dində ifadə olunan ideyalar, təsəvvürlər, məfhumlar sistemi; məfkurə. *Milli ideologiya. Azərbaycançılıq ideologiyası. İdeologiya sahəsində qazanılmış uğurlar.*

**İDEOLOJİ** *sif.* İdeologiyaya aid olan, ideologiya ilə bağlı olan; məfkurəvi. *İdeoloji məsələ. İdeoloji mübarizə. İdeoloji iş. İdeoloji cəhətdən düzgün. – Çox tez bir zamanda "Molla Nəsrəddin" ideoloji, ədəbi sahədə .. demokratizmin həqiqi mərkəzi oldu.* M.İbrahimov.

**İDEÓLOQ** *is.* Hər hansı bir ictimai sinfin, qrupun, cərəyanın ideologiyasını ifadə və müdafiə edən adam. *Proletariatın ideoloqları. Qərb ideoloqları.*

**İDÉYA** [*yun.*] 1. İnsan şüurunda varlığı (həqiqi və ya yanlış şəkildə) əks etdirən və onun bizi əhatə edən mühitə münasibətini ifadə edən anlayış, təsəvvür.

2. Dünyagörüşünün əsas və ən mühüm prinsipi; məfkurə, məslək, əqidə. *İdeya mübarizəsi. İdeya silahı. Qabaqcıl ideyalar. – Yeni Azərbaycan ədəbiyyatında demokratik ideyalar realizm üslubu ilə doğur.* M.İbrahimov.

3. Fikir, qayə, məqsəd. *Sülhü qorumaq və möhkəmləndirmək ideyası. İdeyanı həyata keçirmək.* – [Aslan:] *Demək, sən çox kiçik qəlbli adammışsan. İdeyan da yeməkmiş.* S.Vəliyev. // Bir şeyin əsas və başlıca məqsədi. *Romanın əsas ideyası. Pyesin ideya məzmunu.*

**İDEYACIQ** *isteh.* "İdeya"dan *kiç.* Vecsiz, mənasız, boş ideya, fikir.

**İDEYALI** *sif.* Qabaqcıl ideyası olan, bu ideyalar uğrunda mübarizə edən, bunları təbliğ edən, yayan. *Yüksək ideyalı əsərlər. – İstər "Əhvalatlar", istərsə "Poçt qutusu" dərin ideyalı, yüksək sənət əsərləridir.* M.İbrahimov. // Qabaqcıl ideyalar uğrunda mübarizə edən, öz həyat və fəaliyyətində onlara əsaslanan. *İdeyalı adam. Təbliğatçı yüksək ideyalı və çox hazırlıqlı olmalıdır.*

**İDEYALILIQ** *is.* Yüksək, qabaqcıl ideyada olma. *Milli ədəbiyyatın yüksək ideyalılığı. İncəsənət əsərlərində yüksək ideyalılıq uğrunda mübarizə.*

**İDEYASIZ** *sif.* İdeyası olmayan, ideyadan məhrum; prinsipsiz. *İdeyasız əsər.* // Məsləksiz, məfkurəsiz, qayəsiz.

**İDEYASIZLIQ** *is.* Məfkurəsizlik, qayəsizlik, məsləksizlik.

**İDXAL** *is.* [*ər.*] 1. Daxil etmə, daxil edilmə.

2. Bir ölkəyə başqa ölkələrdən mal gətirilməsi (*ixrac* müqabili). *Xaricdən mal idxalı. Dərman maddələrinin idxalı.* // Ölkəyə gətirilən malların ümumi miqdarı, yaxud ümumi dəyəri. *İdxal ixracdan azdır.*

**İDXALAT** *is.* [*ər.* "idxal" söz. cəmi] Bir ölkəyə başqa ölkələrdən gətirilən mal, məhsulat və s. (*ixracat* müqabili).

**İDXALATÇI** *is. xüs.* Xaricdən mal gətirən. *İdxalatçı dövlət.*

**İDİ** Qoşulduğu sözü keçmiş zamana bağlayaraq ona hekayə mənası verən bağlama. *Onun bir məqsədi var idi. Mən dözməli idim. Bura sahil idi. Bərk çovğun idi. – Qızın paltarı qiymətli parçadan olmasa da, təmiz idi, səliqəli idi.* M.S.Ordubadi. [Kərim baba:] *Qışlaqda idik, payızın aydınlıq gecəsi idi.* A.Şaiq. [Muradın] *saçlarını ağardan yarım əsrlik bir həyat idi.* S.Hüseyn.

**İDİLLİK** *sif.* 1. *əd.* İdilliya mahiyyətində olan, idilliya tərzində olan. *İdillik janr.*

2. *kin.* İdilliyada olduğu kimi; dinc, sakit, qayğısız. *..Həyatı hər növ ziddiyyətdən uzaq və idillik halda təsvir etməyə çalışan yazıçı həqiqi, bədii istedaddan məhrumdur.* (Qəzetlərdən).

**İDİ́LLİYA** [*yun.*] 1. *əd.* Kənd əhalisinin təbiət ağuşunda asudə və sakit həyatını təsvir edən kiçik poetik əsər. *Feokritin zəngin ədəbi irsindən ancaq bir şeir külliyyatı qalmışdır ki, o da otuz idilliyadan və iyirmi üç epiqramdan ibarətdir.* Ə.Sultanlı.

2. *kin.* Dinc, sakit, qayğısız həyat.

**İDİÓM** *is.* [*yun.*] *dilç.* Yalnız müəyyən bir dilə xas olan və mənası tərkib hissələrini təşkil edən sözlərin ayrı-ayrılıqda götürülən mənası ilə düz gəlməyən, parçalanmayan söz birləşməsi; ifadə, ibarə, təbir; məs.: baş sındırmaq, gözü doymamaq, gözünün odunu almaq.

**İDİOMATİK** *sif.* İdiom xarakterində olan, idiomatikaya aid olan. *İdiomatik ifadə.*

**İDİOMÁTİKA** *dilç.* 1. İdiomlar haqqında elm.

2. Bir dildə olan idiomların məcmusu. *Azərbaycan dilinin idiomatikası.*

**İDİÓT** [*yun.*] Anadangəlmə kəmağıl adam, gic.

**İDİOTCASINA** *zərf* İdiot kimi, gic kimi, gic-gic. *İdiotcasına hərəkət etmək. İdiotcasına danışmaq.*

**İDİOTİ́ZM, İDİOTLUQ** *is.* Anadangəlmə kəmağıllıq, giclik.

**İDİŞ** *is. dilç.* Şərqi və Mərkəzi Avropa yəhudilərinin, əsasını alman dialektləri təşkil edən dili.

**İDMAN** *is.* [*ər.*] Orqanizmi inkişaf etdirmək və möhkəmləndirmək məqsədini güdən bədən mümarisələri (hərəkətləri). *İdman məşğələləri. İdman oyunları. İdman meydançası. İdman ustası. – Gündüzlər dərslərə, idmana, oynamağa və sair işlərə məşğul olaraq, belə məişətin ağırlığını bir o qədər hiss etməyirdim.* S.S.Axundov. *Ancaq bircə nəfər kim idisə, həyətdə .. idman eləyirdi.* Mir Cəlal.

**İDMANÇI** *is.* və *sif.* İdmanla məşğul olan (adam). *İdmançılarımız birinciliyi qazandılar. İdmançı oğlan. – Bu halında* [Məcid] *sanatoriya həyətlərində, uşaq meydançalarının qapısında qoyulan idmançı heykəllərinə bənzəyirdi.* Mir Cəlal. *Qara müəllim Lətifin yaxşı bir idmançı olacağına inanırdı.* H.Seyidbəyli.

**İDMANÇILIQ** *is.* İdmanla məşğul olma.

**İDRAK** *is.* [*ər.*] 1. Dərk etmə, bilmə; dərk etmə qabiliyyəti. [Şeyx Sədra:] *Buna idrakınız varırmı sizin? Sizcə məchul qədri şeyxinizin.* H.Cavid. *İdrak ilə vurduğum çəkicimin səsindən; Çatlayır divarları qaranlıq zindanların.* Ə.Cavad. *Bütün bunları 20 yaşına daxil olan Ulduza həyat təcrübəsi deyil, sevən qəlbin, böyük məhəbbətin idrak qüvvəsi öyrədirdi.* Ə.Məmmədxanlı. // Dərrakə, fəhm, şüur, anlaq. *Ər ilə arvadın arasında olan əlaqəyə diqqət yetirdikdə görürük ki, bunların mabeynində təfavüt – əql, fəhm və idrak daha da artıq dərəcədədir.* F.Köçərli. *Həkimül-mülkün keyimiş idrakı vəziyyəti dərk edəcək halda deyildi.* M.İbrahimov. ◻ **İdrak etmək** *klas.* – dərk etmək, anlamaq. *Hər xəyalın idrak edən; Könül güzgüsün pak edən.* Əmani. *Mən idrak etmədim dünyaya gəlməkdən nədir hikmət..* M.Hadi. *Qul olduğunu edincə idrak; Hürriyyətin istəmişdi bibak.* A.Səhhət.

2. *fəls.* Obyektiv aləmin qanunauyğunluqlarının şüurda dərk edilməsi. *İdrak nəzəriyyəsi. Dialektik idrak üsulu.*

**İDRAKLI** *sif.* İdrakı olan, dərrakəli, fəhmli, düşüncəli, şüurlu. *Bu ayda bizim təşkilat ibtidai bir haldan çıxıb .. idraklı, müntəzəm, mübariz bir təşkilat şəklinə keçir.* M.S.Ordubadi. [Gülnisə:] *Sən idraklı olduğun üçün bilirdim ki, sözümü tez anlayacaqsan.* C.Cabbarlı.

**İDRAKLIQ** *is.* Dərrakəlilik, fəhmlilik, düşüncəlilik.

**İDRAKSIZ** *sif.* İdrakı olmayan, dərrakəsiz, fəhmsiz; düşüncəsiz, şüursuz. [Provokasiyaya] *qurban olmuş idraksız .. ermənilər isə müsəlmanları gülləyə basırdılar.* M.S.Ordubadi. [Elxan:] [Solmaz] *idraksız bir kütlənin səfil qorxaqlığına qurban olub gedir.* C.Cabbarlı.

**İDRAKSIZLIQ** *is.* Dərrakəsizlik, fəhmsizlik, şüursuzluq, düşüncəsizlik. *Bizim idraksızlığımız, təşkilatsızlığımız da düşmənlərimizə yardım verir.* M.S.Ordubadi.

**İÉNA** Yaponiyada pul vahidi.

**İFA** *is.* [*ər.*] 1. Bir işi icra etmə, həyata keçirmə, yerinə yetirmə. ☐ **İfa etmək** – 1) yerinə yetirmək, əda etmək. – *Mən özümə aid vəzifələri vaxtında ifa etməyə söz verirəm.* M.S.Ordubadi. [Ənisə] *öhdəsinə alacağı vəzifəni müvəffəqiyyətlə ifa edə bilərdi.* S.Hüseyn; 2) dinlənilmək və ya tamaşa edilmək üçün çalmaq, oxumaq, göstərmək (incəsənət əsərini). *Rol ifa etmək. Rəqs ifa etmək. – Arzu qız atasının arzularını bəstələyir, bir müddət sonra pianoda ifa edir, Əhməd isə dinləyirdi.* S.Rəhimov. *Hündürboy və çox diribaş olan Mürsəl qoçu Əsgər rolunu ifa edirdi.* Ə.Sadıq.

**İFAÇI** *is.* Hər hansı bir incəsənət (dram, ədəbi, musiqi) əsərini ifa etmək üçün çıxış edən adam. *Musiqi ifaçılarının müsabiqəsi. Gözəl ifaçı. Müxtəlif rolların ifaçısı. – Xalq çalğı alətlərində çalan ifaçıların 1939-cu ildə birinci ümumittifaq baxışı təşkil olunmuşdu.* Ə.Bədəlbəyli.

**İFAÇILIQ** *is.* Hər hansı bir musiqi əsərini, yaxud dramatik rolu yaradıcılıqla ifa etmə. *İfaçılıq məharəti. İfaçılıq xüsusiyyəti. – Mirzə Sadıq tarın səsinin xeyli artmasına müvəffəq oldu və tarda ifaçılıq mədəniyyətini yüksək bir mərhələyə qaldırdı.* Ə.Bədəlbəyli.

**İFADƏ** *is.* [*ər.*] 1. Anlatma, izah etmə, aydın və açıq söyləmə, demə, izhar etmə; izah, şərh, bəyan. *Yazılı ifadə* (yazı ilə bildirmə). *Şifahi ifadə* (ağızdan anlatma). *İfadə tərzi. – Bu sualın ahəngi içərisində nə kimi ifadələr olduğunu Zeynal çox yaxşı anlamışdı.* S.Hüseyn. ☐ **İfadə etmək** – demək, söyləmək, izhar etmək, bildirmək, anlatmaq. *Halını ifadə etmək. Fikrini ifadə etmək. – Ləfz edərsə ifadə mənanı; Sərf edər əhli-mərifət anı.* S.Ə.Şirvani. *Cavan müəllim bu sözləri dedikdən sonra ürəyi dolu olan, lakin bunları ifadə etməyə söz tapa bilməyən adamlar kimi susdu.* M.Rzaquluzadə. **İfadə olunmaq** – söylənmək, deyilmək, izah edilmək. *Yazıçının nəsri də onun jurnalistika və dramaturgiyasında ifadə olunan ictimai ideyaları əxz etdirir.* M.İbrahimov.

2. Bir şeyin xarici təzahürünü, inikasını təşkil edən şey. *Qiymət dəyərin pulla ifadəsidir. Hörmət ifadəsi. Səmimiyyət ifadəsi.*

3. *dilç.* Söz, söz birləşməsi; ibarə, fraza. *Frazeoloji ifadə. İdiomatik ifadə. İfadələr lüğəti. Anlaşılmaz ifadə. Obrazlı ifadə. – Şirmayı Səməd Vurğunun odla suyun təzadını vermək üçün bu ifadəni işlətdiyinə əmin idi.* M.Hüseyn.

4. Şagirdlərin öz sözləri ilə yazdıqları mətn. *İfadə yazmaq.*

5. *hüq.* Məhkəmədə məsələni aydınlaşdırmaq üçün şahidin sorğu-suala verdiyi şifahi və ya yazılı cavabı; məlumat, izahat. *Bəlli idi ki, məhkəmə Tahirzadə kimi mötəbər bir şahidin ifadəsini asanlıqla ayaqlaya bilməyəcək.* Mir Cəlal. ☐ **İfadə almaq** – şahidi və ya müttəhimi dindirmək. **İfadə vermək** – məhkəmədə şahidlik etmək, sorğu-suala şifahi və ya yazılı cavab vermək.

6. İnsanın daxili halını əks etdirən əlamət (üzdə, gözdə və s.-də). *Üzünün ifadəsi. Gözlərinin ifadəsi. – Nə gözəldir, nə təmizdir; İfadəsi bu gözlərin.* N.Rəfibəyli. *Melodiya qurtarır. Firuzə valı götürüb, yanında oturan və üzündəki ifadədən fikri uzaqlarda olduğu görünən Sərvinaza uzadır.* İ.Əfəndiyev. *Əmrahovun simasında da ciddi ifadə göründü.* Q.İlkin.

**İFADƏÇİ** *is.* İfadə edən, əks etdirən, təmsil edən. *M.F.Axundovdan sonra ən bö-*

*yük demokrat, bu yeni keyfiyyətli demokratizmin ədəbiyyat sahəsində böyük ifadəçisi C.Məmmədquluzadə* (*Molla Nəsrəddin*) *oldu.* M.İbrahimov.

**İFADƏLƏNDİRİLMƏ** "İfadələndirilmək"dən *f.is.*

**İFADƏLƏNDİRİLMƏK** *məch.* İfadə edilmək, əks etdirilmək.

**İFADƏLƏNDİRMƏ** "İfadələndirmək"-dən *f.is.*

**İFADƏLƏNDİRMƏK** *f.* İfadə etmək, əks etdirmək.

**İFADƏLƏNMƏ** "İfadələnmək"dən *f.is.*

**İFADƏLƏNMƏK** *məch.* İfadə olunmaq, əks olunmaq, öz əksini tapmaq.

**İFADƏLİ** *sif.* Yaxşı və aydın ifadə edən. *İfadəli nitq. İfadəli danışıq. İfadəli yazı. İfadəli* (z.) *oxumaq. – Qız atasının dediklərini çox ifadəli bir dillə yazmışdı.* M.Hüseyn. // Daxili keyfiyyətləri, təəssüratı və s. əks etdirən. *İfadəli baxışlar. İfadəli surət.*

**İFADƏLİLİK** *is.* İfadəli olma, yaxşı və aydın ifadə etmə. *Dilin, üslubun ifadəliliyi. Balerinanın hərəkətlərindəki ifadəlilik.*

**İFADƏSİZ** *sif.* İfadəcə zəif, təsirsiz. *İfadəsiz nitq.* // Heç bir şey ifadə etməyən, heç bir şey əks etməyən. *İfadəsiz gözlər.*

**İFADƏSİZLİK** *is.* İfadəcə zəiflik. *Nitqin ifadəsizliyi. Üslubun ifadəsizliyi.* // Heç bir şey ifadə etməmə.

**İFÇİN** *zərf məh.* Tam surətdə, tamam, bütün, hamısını. *Atı ifçin nallamaq. – Qıratı ifçin yəhərləyib, Koroğlunun qabağına çəkdilər.* "Koroğlu". *Yanında balası o haçadırnaq; Əlvan çiçəkləri ifçin yolardı.* H.K.Sanılı.

**İFFƏT** *is.* [*ər.*] Saflıq, təmizlik, irz, namus, həya, əxlaq. [Maral:] *Hər iki tərəfim təhlükəli uçurum... Burada qalsam, Turxan bəyin murdar nəfəsi, qoşulub qaçarsam, namus, iffət məsələsi..* H.Cavid.

**İFFƏTLİ** *sif.* Namuslu, ismətli, həyalı; təmiz, saf. *İffətli qız. İffətli gəlin. – Zəmanənin "xarab" bir vaxtında nəcib, gözəl, həyalı, iffətli və ismətli bir qız tapmaq çox da asan deyildi.* S.Hüseyn.

**İFFƏTSİZ** *sif.* Namussuz, ismətsiz, həyasız, abırsız. *İffətsiz qadın.*

**İFLAS** *is.* [*ər.*] 1. Bankın, tacirin və s.-nin borc iltizamlarını vaxtında ödəyə bilməməsi nəticəsində müflis olması, sınıq çıxması. *Bankın iflası. Tacirin iflası.* ◻ **İflas etmək (olmaq)** – müflis olmaq, sınıq çıxmaq, var-yoxu əlindən çıxmaq. *Gülara xanım iflas olub, son dərəcə kasıb düşmüş bir bəy ailəsindəndir.* S.Rəhman.

2. *məc.* Hər hansı bir ictimai fəaliyyətdə, yaxud şəxsi həyatda tam uğursuzluq, müvəffəqiyyətsizlik. *Siyasi iflas. Təcavüzkarlıq siyasətinin iflası.* ◻ **İflasa uğramaq** – iflas etmək, puça çıxmaq, heç bir nəticə verməmək, müvəffəqiyyətsizliyə uğramaq.

**İFLİC** *is.* [*ər.*] 1. Orqanizmin hər hansı bir hissəsini və ya üzvünü normal fəaliyyətdən qoyan xəstəlik. *İflic olmaq. İflic vurmaq. İflic tutmaq. Beyin iflici.* // Bu xəstəliyə tutulmuş (adam). *Neçə illərdir iflicdir.*

2. *məc.* Fəaliyyətsizlik, durğunluq, hərəkətsizlik. [Məhərrəm əmi:] *İnan ki, o mələk sandığınız zəhərli ilanlar bir gün sizi iflic, yaramaz və eybəcər qoyacaq.* A.Şaiq.

**İFLİM-İFLİM** *zərf dan.* Tikə-tikə, parça-parça. [Gülpəri:] *Deyir, Tarıqulunun cibini kəsiblər, özünü də iflim-iflim eləyiblər.* Ə.Haqverdiyev.

**İFNA** *is.* [*ər.*] *klas.* Yox etmə, puç etmə, məhv etmə, tələf etmə. *Nə qəm, uğratsa da bir gün məni ifnayə zaman; Mən gedərəmsə, məramım yenə dünyadə durar.* M.Ə.Sabir. *Bu illətin Allaha qalıb bircə davası; Uğratdı bizi büsbütün ifnaya bizim qız.* Ə.Nəzmi.

**İFRAQ** *is.* [*ər.*] *köhn.* 1. Qəlibə tökmə, qəlibə axıtma. // Müəyyən qəlibə salma.

2. Qaydaya salma.

**İFRAT** *is.* [*ər.*] Bir şeyin son həddi, bir şeyi son həddə çatdırma, mübaliğəyə varma, həddi keçmə. *İfrat dərəcə* (son hədd). *İfrat tədbirlər. – Hər işin ifratı vəziyyəti dəyişə bilər.* M.S.Ordubadi. // *sif.* Qəti, barışmaz. *Nə qədər ki əmisi onu təhsildən ayırmayır, cəbrən evləndirmirdi, Fərhadda belə ifrat fikirlər yox idi.* Ə.Haqverdiyev. // *sif.* Çox, həddən ziyadə, son dərəcə. *İfrat qüvvətli. İfrat tamahkar.* ◻ **İfrat etmək (eləmək)** – hüdudu keçmək, həddi keçmək, mübaliğə etmək. **İfrata varmaq** – b a x **ifrat etmək**. *Əlyarov əmisi oğlunun ifrata vardığını görüb, bu söhbəti başqa adamla-*

*rın eşitdiyindən qorxmuş kimi, ürkək nəzərlərlə ətrafına baxındı.* M.Hüseyn.

**İFRATÇI** *is.* İfrata meyil edən, bir işdə ifratçılıq edən. *..Bütün ifratçılarımıza tövsiyəmiz budur ki, işə əhəmiyyət nəzəri ilə baxsınlar.* Ü.Hacıbəyov.

**İFRATÇILIQ** *is.* İfrata varma, ifrata meyil, bir işdə ifrat tədbirlərə əl atma.

**İFRAZ** *is.* [*ər.*] *fiziol.* Orqanizmin bir yerindən (yaradan və s.-dən) bir şey (maye) çıxma, axma. *Narzan mədə şirəsinin ifrazını artırır.* Ə.Əliyev. ◻ **İfraz etmək** – ayırmaq, axıtmaq, dışarı çıxarmaq. *Yaranın ifraz etdiyi irin.*

**İFRAZAT** *is.* [*ər.* “ifraz” söz. cəmi] *fiziol.* Bədənin ifraz etdiyi maddələr. *İrinli ifrazat.* // Nəcis. *..İnsanın və heyvanın bədənindən bayıra çıxan şeylərdə* (*ifrazatda*) *həmişə mikroblar vardır.* N.Nərimanov.

**İFRAZETDİRİCİ** *sif. fiziol.* İfraza səbəb olan. *İfrazetdirici dərmanlar.*

**İFRİT** *is.* [*ər.*] 1. İblis, şeytan, cin. [Padşah:] *Yalan danışma, ifrit, sən bilməyirsən, mən bilirəm.* Ə.Haqverdiyev.

2. Çox sərt, amansız, qəddar adam haqqında. ◻ **İfrit kəsilmək** – bərk acıqlanmaq, amansız olmaq, qəzəblənmək. *O gün Dursun ifrit kəsilmişdi.* A.Şaiq.

**İFRİTƏ** *is.* və *sif.* [*ər.*] *dan.* Çox çirkin, bədheybət, bədləkər, kifir (qadın haqqında). *İfritənin biridir.* // Araqarışdıran, pislik edən, fitnəkar qadın haqqında. *Elə qarı qapını örtcək dəyişilib oldu bir küpəgirən ifritə, cadu.* (Nağıl). *O ifritə qadının alçaq fitnəsini hamımız başa düşdük.* M.Hüseyn. [Yusif:] ..[Səməd] *mən istəyirəm bu ifritə* [Qaradonlu] *sənin qanını qaraltsın.* İ.Hüseynov. // Söyüş mənasında. [Padşah:] *Yalan danışma, ifritə! Sən bilmirsən, mən bilirəm.* Ə.Haqverdiyev.

**İFRİTƏLİK** *is.* Həddən artıq çirkinlik, eybəcərlik, bədheybətlik, bədləkərlik.

**İFŞA** *is.* [*ər.*] Faş etmə, aşkara çıxarma, meydana çıxarma, üstünü açma. ◻ **İfşa etmək** – faş etmək, üstünü açmaq, üzə çıxarmaq, meydana çıxarmaq, açıb göstərmək (birinin cinayətini, gizli niyyətini və s.-ni). *Düşmənin hiyləsini ifşa etmək. – Çar hökuməti və onun nümayəndəsi olan Hacısəməd xanın siyasətini ifşa etməli idik.* M.S.Ordubadi. *“Ölülər” .. ümumiyyətlə, cəhaləti, geriliyi, ikiüzlülüyü və yalanı ifşa edir..* M.İbrahimov. *Qəhrəman .. tayfabazlıq salanları kütlənin əli ilə ifşa etmişdi.* Ə.Vəliyev.

**İFŞAÇI** *is.* Birinin cinayətinin, hiyləsinin, pis niyyətinin üstünü açan, ifşa edən, aşkara çıxaran, açıb göstərən adam.

**İFŞAÇILIQ** *is.* İfşa etmə, ifşa ilə məşğul olma.

**İFŞAEDİCİ** *sif.* İfşa edən, faş edən, üstünü açan, aşkara çıxaran, açıb göstərən, ifşa mahiyyətində olan. *İfşaedici sənədlər. İfşaedici dəlillər. – Bakı komitəsi çar hökumətinin avqust ayındakı xəyanətini ifşaedici bir proklamasiya buraxdı.* M.S.Ordubadi.

**İFŞAEDİCİLİK** *is.* İfşa etmə, ifşa mahiyyətində olma.

**İFTADƏ** *f.sif.* [*fars.*] *klas.* Düşkün, mübtəla. *Bu fəxr yetər kim mənə, iftadeyi-eşqəm; Sal başıma bir sayə hümayi-kərəmindən.* Ə.Vahid.

**İFTADƏLİK** *is.* Düşkünlük, mübtəlalıq. *İftadəliyim gör, etmə ehmal; Rəhm et, bir əyaq ilə əlim al!* Füzuli.

**İFTAR** *is.* [*ər.*] *din.* Oruc açma, oruc açdıqda yeyilən yemək. *Xavərimsə bu gün oruc tutmuş olduğundan, axşam üçün iftar tədarükü görürdü.* T.Ş.Simurq. ◻ **İftar açmaq (yemək)** – oruc açmaq. *Axund iftarı yeyib, təsbehi alır əlinə, başlayır hesablamağa.* Ə.Haqverdiyev. *Tacir qızı isə: – Axund oruc idi, bir saat bundan əvvəl iftarını açıbdır. – dedi.* M.S.Ordubadi. // Oruc açma vaxtı, gün batanda. Molla cavabında deyir: *– Niyə ayıb olur ki, iftar vaxtıdır da..* “M.N.lətif.” *İftara bir az qalanda mömin müsəlmanlar təsbeh çevirə-çevirə, dodaqları duanı vird eləyəndə, ürəkləri də plov çağırır.* C.Məmmədquluzadə. *Bu top orucluqdan orucluğa, bir dəfə obaşdan, bir dəfə iftarda atılardı.* P.Makulu.

**İFTARLIQ** *is. din.* İftar (oruc açma) üçün hazırlanan yemək(lər).

**İFTİXAR** *is.* [*ər.*] 1. Fəxr, fəxr etmə. *Bu gündən belə İran əhli öz millətləri ilə iftixara haqlıdır.* Ü.Hacıbəyov. *“Molla Nəsrəd-*

*din" bizim inkişaf tariximizdə, xalqımızın ictimai həyatında çox mühüm və iftixara layiq bir hadisədir.* M.İbrahimov. // *Qürur hissi.* [Barxudar] *qayıdan gün öz adını ümumi iclasın qətnaməsində oxuyanda sevincindən, heyrətindən, ya iftixarındanmı, nədənsə rəngi qızardı.* Mir Cəlal. *Bayram kişi aydın seçilən iftixar hissi ilə bu meyvələri göstərib dedi..* M.Rzaquluzadə. // Fəxr edilməli, fəxr edilməyə layiq şəxs. *Füzuli Azərbaycan xalqının iftixarıdır. – Mirzə Valeh bu evin mötəbər siması, məclislərin iftixarı olmuşdu.* S.Rəhimov. ☐ **İftixar etmək** – fəxr etmək. [Abas:] *Mən də, ac, yoxsul bir həyatdan belə bir dərəcəyə yüksəldiyimə iftixar edirəm.* M.İbrahimov. // Təkəbbür, qürur, qürrələnmə. *Politikadır hər işləri, alışları-verişləri; Olarda bir əməl fəqət quru, boş iftixarı gör!* M.Ə.Sabir.

2. **İftixarla** şəklində *zərf* – qürurla, fəxrlə, iftixar hissi ilə. *Keçir bizim qəhrəmanlar; Alay-alay, iftixarla.* S.Vurğun. *Yusif mütəxəssis üzümçüyə məxsus iftixarla dedi: – Odur, o dərə araları üzüm üçün qızıldır.* B.Bayramov.

**İFTİXARLANMA** "İftixarlanmaq"dan *f.is.*

**İFTİXARLANMAQ** *f.* İftixar etmək, fəxr etmək, qürrələnmək, öyünmək.

**İFTİRA** *is.* [*ər.*] Böhtan, şər. *Xülasə, qalan yüz on beş kağız da bu məzmunda növnöv iftira və yalan.* C.Məmmədquluzadə. *İki tərəf bir-birinə olmazın böhtan və iftirasını, olmazın həyasız hərəkətlərini isnad verirdilər.* Çəmənzəminli. *Səttarzadə başını tovladı: – Siz məni doğma qızım ilə ləc salmaq istəyənlərin iftirasına uymayın!* Mir Cəlal. ☐ **İftira etmək** – böhtan atmaq, şər atmaq.

**İFTİRAÇI** *is.* İftira edən, böhtan atan, böhtançı.

**İFTİRAÇILIQ** *is.* Başqalarına şər atma, böhtan demə, böhtançılıq. *İftiraçını ifşa etmək.*

**İGİD** *sif.* Bir işdə, döyüşdə qoçaqlıq, cəsarət, qəhrəmanlıq, mərdlik göstərən; cəsur, qoçaq. *İgid oğlan. İgid qız. – Rövşən Rüstəm kimi igid, yeniyetmə, cavan bir oğlan idi.* "Koroğlu". [Fitnə:] *..Mənzər igid pəhləvandır; Həm də gözəl bir insandır.* A.Şaiq. *Dayanmışdır keşikdə; İgid, qəhrəman Bakı; Əziz, mehriban Bakı.* R.Rza. // İs. mənasında. *Gülü biçənə qurban; Suyun içənə qurban; Dünyada igid çoxdur; Candan keçənə qurban.* (Bayatı). *Qaralar geymə gəl, sevimli canan; İgidə meydanda ölmək şərəfdir.* M.Rahim.

**İGİDCƏ(SİNƏ)** *zərf* Qəhrəmancasına, mərdanə, qorxmadan, igid kimi. *İgidcəsinə çarpışmaq. İgidcə vuruşmaq. – Ah, adəmmi olmayan hünəri; Qorxmayın həp, igidcə qalxışınız.* A.Şaiq.

**İGİDLƏNMƏ** "İgidlənmək"dən *f.is.*

**İGİDLƏNMƏK** *f.* Özünü igid kimi, qorxmaz kimi göstərmək.

**İGİDLƏŞMƏ** "İgidləşmək"dən *f.is.*

**İGİDLƏŞMƏK** *f.* İgid olmaq, cəsarətli olmaq, daha da ürəkli olmaq; igidlənmək.

**İGİDLİK** *is.* Qoçaqlıq, qəhrəmanlıq, rəşadət. *Duman dağa pərdədir; Göydə deyil, yerdədir; Ağalıq dövlət olsa; İgidlik hünərdədir.* (Bayatı). [İsgəndərin] *igidlikdə, at çapmaqda, düşmən bağrı yarmaqda tayıbərabəri yox idi.* Ə.Haqverdiyev. *Müəllimlər qəhrəman əsgərlərin cəbhədəki igidliyi haqqında şagirdlərə maraqlı söhbətlər edib onları ruhlandırdılar.* Ə.Vəliyev. ☐ **İgidlik göstərmək (etmək, eləmək)** – rəşadət göstərmək, qəhrəmanlıq etmək, qoçaqlıq eləmək. *Otuzunda kəklik kimi səkərsən; İgidlik eləyib qanlar tökərsən.* "Koroğlu". [Şiraslan:] *Əgər atası Vətən yolunda igidlik etməsəydi, haradan onun adı qalar, ona belə qızıl ulduzla bərabər böyük bir orden və ayrıca fərman verilərdi.* S.Rəhimov.

**İGİDÖLMÜŞ** *sif.* və *is. dan.* Qarğış, nifrin kimi işlənən sözdür.

**İĞFAL** [*ər.*]: **iğfal etmək** – qəflətə salmaq, qəflətdə buraxmaq; aldatmaq, fikrini yayındırmaq, yuxulatmaq. [Şah:] *Zira dili çox itidir, yenə də sizi iğfal edər.* C.Cabbarlı. [Gənc:] *Zeynal* [Mehribanı] *aldadıb iğfal etmək məqsədi ilə yalan danışmağa təşəbbüs etməsin.* S.Hüseyn.

**İĞTİŞAŞ** *is.* [*ər.*] Qarğaşalıq, qarışıqlıq, hərc-mərclik. *İstanbulda 31 martda vaqe olan iğtişaşın nəticəsidir ki, bütün Türkiyə-*

*nin hər bir nöqtəsində bahalıq üz verdi.* C.Məmmədquluzadə. *Hətta iğtişaş zamanı böyük-böyük qəzalara düçar olanda bir dəfə də* [Hacı Qasımın] *qızı üzünü açmağa razı olmamışdı.* E.Sultanov. *Hər yerdə iğtişaş, hər yerdə üsyan; Alovlu nəğmələr ucalır göyə.* S.Rüstəm. ☐ **İğtişaş qalxmaq (düşmək)** – hərc-mərclik düşmək, qarışıqlıq düşmək, şuluqluq düşmək. *Deyirlər ki, Teymurləngin hakimiyyəti illərində bir şəhərdə böyük bir iğtişaş qalxır.* "M.N.lətif." [Nəcmi:] *Bu vaxta kimi əlbir-dilbir, asayişlə yaşayan .. bu dinc camaatın arasına nə üçün iğtişaş düşsün?* Ə.Əbülhəsən.

**İĞTİŞAŞÇI** *is.* İğtişaş, hərc-mərc törədən, asayişi, əmin-amanlığı pozan, şuluqluq salan; araqarışdıran, fitnəkar, fəsadçı.

**İĞTİŞAŞLI** *sif.* Qarışıq, nizamsız, hərc-mərc. *İğtişaşlı yer. İğtişaşlı şəhər.*

**İHANƏT** *is.* [*ər.*] *klas.* Haqsız təhqir, haqsızlıq. *Çox yetər əğyardən cövrü ihanət könlümə.* M.P.Vaqif. *Aşmışdı hələ həddini kəndlərdə rəzalət; Hər yanda təcavüzdü, ihanətdi, həqarət!* Ə.Nəzmi.

**İHATƏ** b a x **əhatə**. *Qalıbdır firqeyi-islam dalda cümlə millətdən; İhatə eyləyiblər başqalar elm ilə dünyanı.* S.Ə.Şirvani. *Qanlı şəhər görünməyir, etmiş ihatə çən, duman.* Ə.Nəzmi.

**İXLAS** *is.* [*ər.*] 1. Səmimi və qərəzsiz məhəbbət, ürəkdən gələn sədaqət; səmimiyyət, sidq. [Nuxalılar:] *Bizim ixlasımızın nisbəti Molla İbrahimxəlilə görə sair kimsələrin ixlasına bənzəməz.* M.F.Axundzadə. [Mirzə Həbib:] *Özünüz bilirsiniz ki, mənim nə mərtəbədə sizə ixlasım var.* N.Vəzirov. *Böyüyün kiçiyə iltifat və mərhəməti, kiçiyin də böyüyə qarşı ixlas və hörməti vardı.* S.Hüseyn.

2. **İxlasla, ixlas ilə** şəklində *zərf* – sədaqətlə, səmimi qəlblə, ürəkdən. [Mirzə Möhsün:] *..Saqqalımın tükünü dövləti-aliyyənin xədəmatında ixlas ilə ağartmışam.* M.F.Axundzadə. [Kəndli:] *Sizə məlumdu ki, mən on yeddi ildi ki, .. ixlas ilə qulluq eləyirəm.* C.Məmmədquluzadə.

**İXLASKAR** *sif.* [*ər.* ixlas və *fars.* ...kar] Sədaqətli, sadiq, ixlas edən, səmimi.

**İXLASKARLIQ** *is.* Sədaqət, səmimiyyət, səmimi məhəbbət.

**İXLASKEŞ** *sif.* [*ər.* ixlas və *fars.* ...keş] *köhn.* b a x **ixlaskar**. [Teymur ağa:] *Bəylər və xanın çoxusu mənim atamın yaxşılıqları səbəbinə mənə ixlaskeşdir.* M.F.Axundzadə.

**İXLASKEŞLİK** *köhn.* b a x **ixlaskarlıq**.

**İXRAC** *is.* [*ər.*] 1. Çıxarma, uzaqlaşdırma. ☐ **İxrac etmək** – çıxarmaq, uzaqlaşdırmaq. **İxrac olmaq** – xaric olmaq, ixrac edilmək, çıxarılmaq.

2. *iqt.* Satış üçün xarici ölkələrə göndər(il)mə (*idxal* əksi). *İxracı gücləndirmək. Neft ixracı. Taxıl ixracı.* // Xarici bazara göndərilən malın ümumi dəyəri və ya həcmi, həmçinin malın özü; ixracat, eksport. ☐ **İxrac etmək** – satış üçün xarici bazarlara göndərmək. *Xarici bazarlara mal ixrac etmək. Respublikamız bir çox xarici ölkələrə neft avadanlığı ixrac edir.*

**İXRACAT** [*ər.* "ixrac" söz. cəmi] b a x **ixrac** 2-ci mənada. *İxracat ildən-ilə artır.*

**İXRACATÇI** *is.* İxrac edən, xarici ölkələrə mal göndərən ölkə. *Birma dünyanın böyük düyü ixracatçısı hesab olunur.* (Qəzetlərdən).

**İXTİLAF** *is.* [*ər.*] Fikir ayrılığı və bunun nəticəsində doğan ziddiyyət, uymamazlıq, mübahisə. *..Həqiqət axtarılan yerdə mütləq ixtilaf olur.* C.Məmmədquluzadə. [Rəhim bəy] *Məşədi bəylə ixtilafını biryolluq həll etmək bəhanəsi ilə qardaşı evinə getdi.* M.Hüseyn. ☐ **İxtilaf salmaq (çıxarmaq)** – ikitirəlik salmaq; mübahisə, münaqişə, ziddiyyət törətmək.

**İXTİLAFLI** *sif.* Mübahisəli, münaqişəli, mübahisəyə səbəb olan. *İxtilaflı məsələ. – Kənd şurası belə ixtilaflı məsələni həll edə biləcək halda deyildi..* S.Hüseyn.

**İXTİLAFLILIQ** *is.* İxtilaflı, mübahisəli olma.

**İXTİLAFSIZ** 1. *sif.* Mübahisəsiz, münaqişəsiz. *İxtilafsız məsələ.*

2. *zərf* İxtilaf olmadan, heç bir mübahisə, münaqişə olmadan. *Məsələ ixtilafsız həll olundu.*

**İXTİLAFSIZLIQ** *is.* İxtilafın, mübahisənin, münaqişənin olmadığı hal.

**İXTİLAL** *is.* [*ər.*] Qarışıqlıq, qarğaşalıq, hərc-mərclik, iğtişaş. *Cahan müharibəsi, ..*

*sonra Zaqafqaziyada baş verən ixtilal və qarışıqlıqlar... Bu zamanlarda mən Bakıda deyildim.* S.Hüseyn. ◻ **İxtilal törətmək (salmaq)** – qarışıqlıq salmaq; hərc-mərclik, qarışıqlıq, iğtişaş törətmək. [Qubernator:] *Onlar Rusiyanın taxt-tacına qarşı ixtilal törətmək istəyirlər.* C.Cabbarlı.

**İXTİLALÇI** *is.* İxtilal törədən, hərc-mərclik, qarışıqlıq, pozğunluq salan. [Əbu Übeyd:] *Ölkənin bütün ixtilalçı ünsürləri əldən qaçırıldı.* C.Cabbarlı.

**İXTİLAT** *is.* [*ər.*] *klas.* Oturub-durma, görüşüb əlaqə saxlama, qaynayıb-qarışma. *Nə bir fərəhi, nə bir nişanı; Nə kimsə ilə bir ixtilatı.* Füzuli. // Söhbət. *İxtilatın şirin, sözün məzəli; Şəkər gülüşündən canlar təzəli.* M.P.Vaqif. ◻ **İxtilat etmək (qatmaq)** – söhbət eləmək, söhbətləşmək. *Qadir Allah səbəb salıb araya; Sevdiyim, ixtilat qatmaq çağıdır.* Q.Zakir. *Mən oturub səninlə yaxın, qabaq-qabağa; İxtilat etmişəm söz çəkəndə sabaha.* R.Rza. *Şagird ilə ustad gecə keçənə qədər ixtilat etdilər, çay içdilər.* Ə.Məmmədxanlı. // Kiçik toy məclisi, xudmani söhbət məclisi. *Bizi bu axşam ixtilata çağırıblar.* – [Nurcahan xala:] *Ay kişi! Mən nə eyləyim?. Yetimlərinin başlarını, əndamlarını yumağa getmişdim də. Toya, qonaqlığa, ixtilata getməmişdim ki?* H.Sarabski.

**İXTİLATÇI** *sif.* İxtilat etməyi sevən, söhbət etməyi sevən; söhbətcil. *İxtilatçı qadın.*

**İXTİÓL** [*yun.*] *əcz.* Bəzi dəri xəstəliklərində istifadə edilən sürtmə dərmanı.

**İXTİOLÓGİYA** [*yun.* ichthys və *lat.* logos-dan] Zoologiyanın balıqlardan bəhs edən şöbəsi. *Xüsusi kitabxanada ixtiologiyaya aid hər cür məlumat almaq mümkün olacaq.* (Qəzetlərdən).

**İXTİÓLOQ** [*yun.* ichthys və *lat.* logos-dan] İxtiologiya mütəxəssisi.

**İXTİRA** *is.* [*ər.*] 1. Yaradıcı iş nəticəsində keçmişdə məlum olmayan yeni bir şey tapma, kəşf etmə, yaratma, icad etmə. *Parovozun ixtirası. Radionun ixtirası. Elektron maşınlarının ixtirası.* – [Fərhadoğlu:] *Belə olsun ki, bizim xalqı sevən alimlərin elmi ixtiraları yarımçıq qalmasın.* S.Rəhimov. *Zəmanəmiz söz zəmanəsi deyil, fənn zəmanəsi, ixtira zəmanəsidir.* Mir Cəlal. ◻ **İxtira etmək (eləmək)** – yaradıcı surətdə çalışaraq, keçmişdə məlum olmayan yeni bir şey yaratmaq, icad etmək, düzəltmək. *Yeni maşın ixtira etmək.* // Əsasını qoymaq, yaratmaq. *Bu qəzet kim olub cahanda buna; Bunu kim ixtira edib, aya?* S.Ə.Şirvani. [Yaşar] *bu vaxta qədər dörd ixtira eləmişdir.* C.Cabbarlı. // Yeni ixtira edilmiş şey, ixtiraçının yaradıcı əməyinin məhsulu olan şey; kəşf. *İyirminci əsrin ixtiraları. Mühəndisin yeni ixtirası.* – *..Baxmetyevin ixtirasının əsli budur ki, cəmi heyvanat bir dərəcə donmaq halına çatanda yarıdiri olurlar, yarıölü olurlar..* C.Məmmədquluzadə.

2. *dan. məc.* Uydurma, qondarma. *Bu söz sənin ixtirandır.* ◻ **İxtira etmək** *məc.* – uydurmaq, qondarmaq. [Dostum] *tüfəngləri tərifləyib, ixtira etməyi xoşlardı.* M.Rzaquluzadə.

**İXTİRAÇI** *is.* Bir şeyi ixtira edən adam. [Məmməd:] *Dedilər ki,* [Usta Səməd] *indi böyük bir ixtiraçıdır.* C.Cabbarlı. *Həsən boş vaxtlarını gənc ixtiraçılar və xor dərnəklərində keçirirdi.* H.Seyidbəyli.

**İXTİRAÇILIQ** *is.* İxtiraçının fəaliyyəti, yaradıcılıq işi. *İxtiraçılıq sahəsində böyük işlər. İxtiraçılıqla məşğul olmaq. İxtiraçılıq bürosu.*

**İXTİSAR** *is.* [*ər.*] 1. Qısaltma, azaltma. ◻ **İxtisar etmək** – 1) qısaltmaq, azaltmaq. *Məqaləni ixtisar etmək. Əsərin fəsillərindən birini ixtisar etməli.* // Müxtəsər etmək, qısaltmaq. *Mənimlə, Tanrı üçün, sözdə ixtisar et, kim; Uzun fəsanəyə, vaiz, dilü dəmaq gərək.* Qövsi; 2) miqdarca, sayca azaltmaq. *Ştatları ixtisar etmək. Xərcləri ixtisar etmək;* 3) işdən azad etmək (ştatların azalması münasibəti ilə). *Bir neçə işçini ixtisar etmək lazımdır.* **İxtisar olunmaq** – azaldılmaq (miqdarına, həcminə görə). **İxtisara düşmək** – 1) b a x **ixtisar olunmaq**. *Məqalənin axırı ixtisara düşdü;* 2) ştatların azalması ilə əlaqədar olaraq işdən azad edilmək. **İxtisara salmaq** – b a x **ixtisar etmək**. *Tresti kəsirdən qurtarmaq üçün, birinci növbədə, müşavirə və nitqləri ixtisara salmaq lazımdır.* M.Hüseyn. [Vahidov:] *Sabahdan gərək yuxumu əlli faiz ixtisara salam.* Ə.Məmmədxanlı.

2. *riyaz.* Kəsirdə: sürəti və məxrəci eyni ədədə bölüb azaltma, kiçik ədədlə vermə.

3. **İxtisarla** şəklində *zərf* – müxtəsər, gödək, qısa, ixtisar şəklində. *Məqaləni ixtisarla vermək.*

**İXTİSARƏN** *zərf* [*ər.*] İxtisar yolu ilə, ixtisar şəklində, ixtisar edərək, qısaldılaraq.

**İXTİSARLAMA** "İxtisarlamaq"dan *f.is.*

**İXTİSARLAMAQ** *f.* İxtisar etmək, azaltmaq, qısaltmaq.

**İXTİSARLANMA** "İxtisarlanmaq"dan *f.is.*

**İXTİSARLANMAQ** *məch.* İxtisar edilmək, azaldılmaq, qısaldılmaq.

**İXTİSAS** *is.* [*ər.*] Elmin, texnikanın, sənətin, yaxud incəsənətin ayrıca sahəsi. *O, mühəndis ixtisasını seçmişdir.* – [Fərman] *yenicə imtahan verərək, maşinist ixtisasını qazandığından sevinirdi..* Ə.Sadıq. // Xüsusi hazırlıq nəticəsində əldə edilmiş bilik, sənət, peşə. *İxtisasını artırmaq. Qazmaçı ixtisası. İxtisası üzrə işləmək.* – [Ənisənin] *əmək bursasında bir ixtisası olmadığı üçün qeyd etməyirdilər.* S.Hüseyn. *Kamal orta məktəbi əla qiymətlə bitirmişdi, .. gələcək ixtisas barəsində düşünürdü.* M.Rzaquluzadə. [Sehrbaz] *ixtisasının bütün sirlərini böyük həvəslə öz zirək köməkçisinə öyrədirdi.* S.Vəliyev.

**İXTİSASLANDIRILMA** "İxtisaslandırılmaq"dan *f.is.*

**İXTİSASLANDIRILMAQ** b a x **ixtisaslaşdırılmaq**.

**İXTİSASLANDIRMA** "İxtisaslandırmaq"-dan *f.is.*

**İXTİSASLANDIRMAQ** b a x **ixtisaslaşdırmaq**.

**İXTİSASLANMA** "İxtisaslanmaq"dan *f.is.*

**İXTİSASLANMAQ** *f.* İxtisas əldə etmək, sənət öyrənmək.

**İXTİSASLAŞDIRILMA** "İxtisaslaşdırılmaq"dan 1-ci mənada. *f.is. İstehsalatın ixtisaslaşdırılması.*

**İXTİSASLAŞDIRILMAQ** *məch.* 1. Yalnız bir xüsusi sahədə işləmək və ya istifadə olunmaq üçün uyğunlaşdırılmaq, hazırlanmaq. *Cərgələr arasını becərən traktorlardan istifadə edilməsi işi ixtisaslaşdırılmalıdır.* "Pambıqçılıq".

2. İxtisas öyrədilmək, mütəxəssis edilmək.

**İXTİSASLAŞDIRILMIŞ** *f.sif.* Yalnız müəyyən sahəyə xidmət etmək üçün uyğunlaşdırılmış, hazırlanmış, düzəldilmiş. *İxtisaslaşdırılmış mağaza.*

**İXTİSASLAŞDIRMA** "İxtisaslaşdırmaq"-dan *f.is. İxtisaslaşdırma aparmaq.*

**İXTİSASLAŞDIRMAQ** *f.* 1. Elmin və ya texnikanın hər hansı bir sahəsinə aid ixtisas vermək, bilik vermək, mütəxəssis etmək. *Aspirantları yarımkeçiricilər sahəsində ixtisaslaşdırmaq. Tələbələri XIX əsr ədəbiyyatı sahəsində ixtisaslaşdırmaq.*

2. Yalnız bir xüsusi sahədə işləmək və ya istifadə olunmaq üçün uyğunlaşdırmaq, hazırlamaq.

**İXTİSASLAŞMA** "İxtisaslaşmaq"dan *f.is.*

**İXTİSASLAŞMAQ** *f.* Müəyyən bir sahədə ixtisas qazanmaq; mütəxəssisləşmək. *Neft üzrə ixtisaslaşmaq. Üzvi kimya sahəsində ixtisaslaşmaq. Lüğətçilik sahəsində ixtisaslaşmaq.*

**İXTİSASLI** *sif.* Müəyyən sahədə ixtisası olan; təcrübəli. *İxtisaslı işçilər. İxtisaslı kadrlar.* – [Həyat:] *Kolxoz .. başında ixtisaslı adamlar durmalıdır.* M.İbrahimov. // Xüsusi bilik, hazırlıq tələb edən. *İxtisaslı əmək.*

**İXTİSASSIZ** *sif.* Heç bir ixtisası olmayan, heç bir xüsusi hazırlıq keçməmiş. *İxtisassız işçi.*

**İXTİSASSIZLIQ** *is.* Heç bir ixtisası, xüsusi hazırlığı olmama.

**İXTİYAR**[1] *is.* [*ər.*] 1. Öz arzusu və iradəsi; öz iradə və arzusu ilə hərəkət etmə. *İxtiyar özündədir. Öz ixtiyarı ilə. İxtiyarına buraxmaq.* // Bir şeyə hüququ çatma, bir şeyi etməyə, sərəncam verməyə haqqı, səlahiyyəti olma; haqq, hüquq, səlahiyyət. *Bunun ixtiyarı kimdədir? Bunu etməyə ixtiyarı yoxdur.* – *İxtiyar sənindir, vəfalı dilbər; Mən sənin xətrinə dəyən deyiləm.* "Qurbani". *Xalqın malının, canının, külfətinin ixtiyarı özündə deyildi.* Ə.Haqverdiyev. *..Ancaq kapitan onları başa saldı ki, özü arzu etsə də, buna ixtiyarı yoxdur.* M.Rzaquluzadə. // Sərəncam. *Odur ki, haman yer* [Cəlilin] *ixtiyarında idi.* İ.Musabəyov. [Yaşlı kişi:] *Qapının açarı tamamilə mənim ixtiyarımda idi.* S.Hüseyn. ◻ **İxtiyar almaq** – icazə almaq, rüsxət almaq. // Hüquq əldə etmək.

*Norveç qəzetləri yazırlar ki, vəkil seçmək üçün arvadlar ixtiyar aldılar.* C.Məmmədquluzadə. **İxtiyar etmək** *köhn.* – seçmək, üstün tutmaq, tərcih etmək. *Nola Təbrizi gər Qövsi behiştə ixtiyar etsə; Kim onun xaki-payi sürmeyi-çeşmi-İsfahandır.* Qövsi. [Şah Abbas:] *Ona binaən labüdəm ki, tələğınızı verib cümlənizi azad edim ki, hər kəsə meyliniz olsa, onu ixtiyar edəsiniz.* M.F.Axundzadə. *Münəvvər isə məcburən .. bozarmış anasının qabağına düşüb getməyi ixtiyar etmişdi.* M.S.Ordubadi. **İxtiyar işlətmək** – sərəncam vermək, göstəriş vermək, böyüklük etmək, icazə vermək. [Qoca:] *Biz sənə ixtiyar işlədə bilmərik.* A.Divanbəyoğlu. **İxtiyar sahibi** *köhn.* – 1) bir şey haqqında hökm etməyə, sərəncam verməyə hüququ, səlahiyyəti olan adam. *O zaman bir ixtiyar sahibi "asaram" desəydi, bil ki, asar, "kəsərəm" desəydi, kəsər, sürgün deyə hökm çıxarsaydı, sürgün edərdi.* S.Rəhimov; 2) öz iradəsi ilə hərəkət edən, ixtiyarı özündə olan. **İxtiyar verilmək** – icazə verilmək, rüsxət verilmək. *Rusiyanı dalğalandıran 1905-ci il inqilabından sonra .. senzor tərəfindən ixtiyar verilməyən kitablar da mətbuat aləminə buraxıldı.* T.Ş.Simurq. **İxtiyar vermək** – icazə vermək, rüsxət vermək. *..Kağızpaylayana ixtiyar vermişik ki, müştərilərimizdən qabaqca bir şey almayınca onların jurnalını aparıb verməsin.* "Mol. Nəsr.". **İxtiyarı əlində olmaq** – bir şeyi etməyə hüququ çatmaq; haqqı, hüququ olmaq. [Əsgər] *hiss edirdi ki, ixtiyarı tamamilə öz əlindədir.* S.Hüseyn. **İxtiyarı getmək** – öz hüququndan, haqqından məhrum olmaq, heç bir şeyə ixtiyarı qalmamaq. *Günbəgün əksilib şövkəti, şanı; İxtiyarı gedən bəs ağlamazmı?* M.V.Vidadi. **İxtiyarı ilə, öz ixtiyarı ilə** – öz xoşu ilə, öz məsləhəti ilə. *Aşiqəm, zahid, məni məzur tut ki, hiç kim; İxtiyar ilə vidai-əqlü iman eyləməz.* Qövsi. **Nə ixtiyarın (ixtiyarım) var** – ixtiyarın (ixtiyarım) yoxdur, nə cürətlə. [Məşədi İbad:] *Sənin nə ixtiyarın var ki, mənim adaxlımın adını çəkirsən?* Ü.Hacıbəyov **...ixtiyarına buraxmaq (vermək)** – sərəncamına vermək. *Konsulxananın avtomaşınını könüllü yığmaq üçün seçilmiş komisyonun ixtiyarına buraxmışdıq.* M.S.Ordubadi. **Öz ixtiyarına qoymaq** – özbaşına buraxmaq, imkan vermək, mane olmamaq. *Anasıyçın ağlayan körpə uşaq olardım; Qoysaydılar məni öz ixtiyarıma..* N.Rəfibəyli.

2. Qüvvət, güc, taqət. *İxtiyarı yoxdur yerindən qalxsın. – Nagahdan gözlərim görəndə səni; Qalmadı canımda ixtiyar, gəlin!* M.P.Vaqif. [Balaqardaş:] *Dura bilməyirəm, ixtiyarım yoxdur..* N.Vəzirov. ◻ **İxtiyarı (əlindən) getmək (üzülmək)** – taqətsiz olmaq, gücdən düşmək, əldən düşmək. *Deyib danışmağa gəlmir heç varı; Üzülübdür ixtiyarı Həsənin.* Aşıq Həsən. [Zabit:] *..Gözümün içinə elə baxdı ki, varımdan yox oldum, ixtiyarım əlimdən getdi..* E.Sultanov. **İxtiyarı(nı) əlindən almaq** – üzmək, taqətdən salmaq. *Əmani bulsa şeydayı tən irməz; Alıbdır eşq əlindən ixtiyarı.* Əmani.

**İXTİYAR**[2] *sif.* [*ər.*] Qoca, yaşlı; pirani. *İxtiyar kişi. – İxtiyar qadın iki kərə gəlib nahar hazır olduğunu söylədi.* M.S.Ordubadi. *Mehribanın atası, ixtiyar bir adam olmasına baxmayaraq, çox da avam deyildi.* S.Hüseyn. [Misxetdə] *qonşum – bir ixtiyar, əlil rus zabiti ilə tanış oldum.* E.Sultanov. ◻ **İxtiyar olmaq** – qocalmaq. *İxtiyar olmuş könüllər oldular yeksər cavan; Əlaman bu müstəbidlərdən, ilahi, əlaman!* Ə.Qəmküsar. // İs. mənasında. *Qızlar, gəlinlər sevinir, uşaqlar, gənclər, ixtiyarlar sevinir, bütün kainat belə sevinirdi.* C.Cabbarlı. *Kəndin ixtiyar və ağsaqqalları yavaş-yavaş məscidə tərəf gedirdilər.* S.Hüseyn. // *məc.* Qədim, dünyagörmüş. *İxtiyar dağların döşündə meşə; Qayalar yüksəkdən baxır keçmişə.* S.Vurğun.

**İXTİYARAT** *is.* [*ər.* "ixtiyar" söz. cəmi] bax **ixtiyar**[1]. *Əlbəttə, milləti qorumaq, onun malını, mülkünü saxlamaq üçün, müvəqqəti də olsa, ixtiyarat lazımdır.* S.Rəhimov. *Hacının özünün, var-dövlətinin ixtiyaratı ..* [Münəvvərdə] *idi!* Mir Cəlal.

**İXTİYARİ** *sif.* [*ər.*] İnsanın öz iradə və arzusu ilə olan, baş verən; məcburi olmayan, iradi (*qeyri-ixtiyari* ziddi). *İnsan üçün səciyyəvi olan ixtiyari hərəkətlər şüurlu surətdə qarşıya qoyulmuş məqsədlə icra olunur.* M.Məhərrəmov.

**İXTİYARİLİK** *is.* İxtiyari olma; öz iradə və arzusu ilə olma, baş vermə; qeyri-məcburilik, könüllülük, iradilik.

**İXTİYARLAŞMA** "İxtiyarlaşmaq"dan *f.is.*

**İXTİYARLAŞMAQ** *f.* Qocalmaq, yaşa dolmaq.

**İXTİYARLIQ** *is.* Qocalıq, piranilik. [Xəyyam:] *İxtiyarlıq nə uğursuz əngəl; Nə tühaf, yetmişə gəlmiş də yaşım.* H.Cavid.

**İXTİYARSIZ** 1. *zərf* Özündən asılı olmayaraq, özü istəmədən; qeyri-iradi, qeyri-ixtiyari. *İxtiyarsız ağlamaq. İxtiyarsız demək. İxtiyarsız gülmək. – Bostan əkdim xiyarsız; Günüm keçdi biyarsız; Yuxuda səni gördüm; Ayıldım ixtiyarsız.* (Bayatı). *Rüxsarə xanım ixtiyarsız üzünü açdı.* T.Ş.Simurq. *Tofiq ixtiyarsız olaraq dönüb dala baxdı.* M.Rzaquluzadə.

2. *sif.* Hüquqsuz, ixtiyarı olmayan.

**İXTİYARSIZLIQ** *is.* Heç bir şeyə ixtiyarı, hüququ olmama; hüquqsuzluq.

**İKEBÁNA** *is.* [*yun.*] 1. Gülbağlama sənəti.

2. Süni ağac və ya gül.

**İKƏN** *bağ.* Qoşulduğu söz və ya tərkibdə çağ, zaman, yaxud hal-vəziyyət bildirir. *Ol sərvin ayağı bağlı oldu; Azadə ikən adaqlı oldu.* Füzuli. *Tifli-məsum ikən günah etdin; Kəndi vicdanını təbah etdin.* M.Ə.Sabir. [Murad] *Nigarı daha kiçik bir qız ikən xoşlamışdı.* S.Hüseyn.

**İKİ** *miqd. s.* 1. Birdən sonra gələn ədəd – 2. *İki dəfə iki. Dörddən iki çıxmaq.* // Miqdarca iki bildirir. *İki kitab. İki otaq. İki qardaş. İki yoldaş. – Söhbətin bu yerində çayçı Qurban iki stəkan limonlu çay gətirdi.* H.Nəzərli. [Rəşid:] [Bəyim xala] *cəmi-cümlətanı iki kərə mənim suallarıma bir qədər təfərrüatla cavab vermişdi.* İ.Hüseynov.

2. *dan.* Bir neçə, çox az mənasında. *İki sözü bir-birinə qoşa bilmir. İki kəlmə ilə başa salmaq. İki dəqiqə vaxtınızı alacağam.* – [Qəhrəman:] *İki dəqiqə keçməmiş .. otaqdan əvvəlcə dəhşətli və sonra zarıltıya çevrilən bir səs eşitdim.* H.Nəzərli.

3. Beşballı sistemdə şagirdin, tələbənin müvəffəqiyyətini göstərən nömrə; "pis". *2 almaq. Heç 2-yə cavab verə bilmədi.*

◊ **İki ayağını bir başmağa təpmək** – b a x **iki ayağını bir başmağa dirəmək** ("**ayaq**[1]"da). [İbad:] *Deyir, bəs dünən* [Almaz] *iki ayağını təpmişdi bir başmağa?* C.Cabbarlı. **İki bədəndə bir ürək** – sevgililər haqqında. **İki cüt bir tək** – çox az. **İkidə bir** – yarı. **İki daşın arasında** – çox namünasib vaxtda, tələsik. **İki gözü** – ən əzizi, ən istəklisi. **İki gözünü bir deşikdən çıxartmaq** – b a x **gözünü çıxartmaq** 1-ci mənada ("**göz**"də). [Gülsənəm:] [İmran] *əgər görsə ki, biri camaata ziyan verir, onun iki gözünü bir deşikdən çıxarar.* M.Hüseyn. **İki güləşənin biri yıxılar** *məc.* – çəkişən, vuruşan iki tərəfdən birinin məğlub olması mənasında. [Kim isə:] *İki güləşənin biri yıxılacaq.* M.Hüseyn. **İki könül bir olmaq** – birləşmək, sevişmək mənasında. *Əzizim, dalda yeri; Yel tutmaz dalda yeri; İki könül bir olsa; Tez tapar dalda yeri.* (Bayatı). **İki yanına göz gəzdirmək** – hər tərəfinə, ətrafına baxmaq. *Xəlil iki yanına göz gəzdirdi.* M.Hüseyn. **İkidə-birdə** – tez-tez. **İkidən-birdən** – heç (bir şeyin, hadisənin olmadığını bildirir). *İkidən-birdən sizə gələnəm?* – [Kərbəlayı:] *Adə, ikidən-birdən qəzet alanam?* M.Hüseyn. *Heç ikidən-birdən gəlib deyibsənmi ki, Zərəfşan, Kərim dayının haqqında belə deyirlər, nə qayıraq?..* İ.Hüseynov.

**iki-iki** *zərf* 1. Hər birinə, yaxud hər dəfəsinə iki. *İki-iki alma vermək. İki-iki düzmək. İki-iki ayırmaq.*

2. İkisi yan-yana, ikisi bir yerdə, birgə, bərabər. *İki-iki durmaq. İki-iki oturmaq.*

**iki...** – bu sayla əlaqədar olan bir sıra mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: ikibaşlı, ikimotorlu, ikiotaqlı, ikiyerli.

**İKİADAMLIQ** *sif.* İki adam üçün olan, iki adam yerləşə bilən; ikinəfərlik. *İkiadamlıq çarpayı. İkiadamlıq loja.*

**İKİADLI** *sif.* İki ad daşıyan, iki adı olan.

**İKİAĞIZLI** *sif.* Hər iki tərəfi kəsən, iki tiyəsi olan. *İkiağızlı bıçaq. İkiağızlı xəncər.* – [Ələmdar:] *Bu ikiağızlı qılıncımla onu qiymə-qiymə doğraram!* S.Rəhimov. *İkiağızlı qılınclar havada bərq vurub sağısolu biçir.* Ə.Məmmədxanlı.

**İKİAKTLI** *sif.* b a x **ikipərdəli**.

**İKİARŞINLIQ** *sif.* İki arşın uzunluğunda olan.

**İKİARVADLI** *sif. köhn.* İki arvadı olan, iki arvad saxlayan. [Zeynal] *tamamilə ikievli, ikiarvadlı idi.* S.Hüseyn. // İki qadın olan. *İkiarvadlı ev süpürülməmiş qalar.* (Məsəl). // İs. mənasında. [Gülsabah Məşədi Qədimə:] *Hələ orada da sənin kimi ikiarvadlılardan danışırlar.* T.Ş.Simurq.

**İKİARVADLILIQ** *is. köhn.* İki arvadı olma, iki arvad saxlama. *Məşədi Qədimin ikiarvadlılığı çoxdan deyildi.* T.Ş.Simurq. [Ceyran] *ümumiyyətlə, kənd kişilərini ikiarvadlılıqda töhmətləndirirdi.* S.Hüseyn.

**İKİATLI** *sif.* İki at qoşulmuş. *İkiatlı araba. İkiatlı fayton.*

**İKİATOMLU** *sif. kim.* İki atomdan ibarət olan. *İkiatomlu birləşmə.*

**İKİAVARLI** *sif.* İki avarı olan; qoşaavarlı. *İkiavarlı qayıq.*

**İKİAYAQLI** *sif.* 1. İki ayağı olan.

2. *məc. dan.* İnsan mənasında epitet kimi işlənir. [Xortdan:] *Tehranda bir nəfər ikiayaqlı qalmadı.* Ə.Haqverdiyev.

**İKİAYLIQ** *sif.* 1. İki ay davam edən və ya davam etmiş. *İkiaylıq ezamiyyət. İkiaylıq məzuniyyət. İkiaylıq kurslar.* // İki aydan bir nəşr olunan, çıxan (jurnal, qəzet və s).

2. Yaşı iki aydan ibarət olan. *İkiaylıq uşaq.*

**İKİBARMAQLI** *sif.* Əlində, ya ayağında ancaq iki barmağı olan.

**İKİBAŞA** *zərf* Hər iki tərəfə, hər iki başa. *Maşını ikibaşa danışmaq.*

**İKİBAŞLI** *sif.* 1. İki başı (ucu, qurtaracağı) olan. *İkibaşlı ağac.*

2. İki başı olan. *İkibaşlı heyvan.* – [Dərviş:] *Dünyamız dərə-təpəli, dərin-dərin quyulardır; qanxor, rəhmsiz, ikibaşlı əjdahalar, – deyib bağırırıq.* A.Divanbəyoğlu.

3. Hər iki tərəf üçün, həm o tərəfə, həm bu tərəfə. *İkibaşlı bilet. İkibaşlı teleqram. – Laəlac qalıb, götürüb Kislovodskiyə ikibaşlı tel vurub bu barədə məsləhət soruşdum.* C.Məmmədquluzadə. ☐ **İkibaşlı qohum olmaq** – qız verib, qız almaq. [Əsgər:] *Bax, bəy, indi ki mənimlə qohum olmaq istəyirsən, gəl ikibaşlı qohum olaq.* Ü.Hacıbəyov. [Gövhər:] *Deməli, sən bizimlə ikibaşlı qohum olmaq istəyirsən?* S.Rəhman.

4. *məc.* İkimənalı, ikitərəfli, iki cür başa düşülə bilən; aydın, konkret olmayan, dumanlı. [Dəli Həsən dedi:] *Koroğlu, sözün bir az ikibaşlıdı.* "Koroğlu". *Pərşan Qızyetərin Salmanı bəyənmədiyini, sözlərinin ikibaşlı* (z.) *olduğunu bilirdi.* M.İbrahimov. *Nərminə Şahmarın dediyi ikibaşlı sözün mənasını anladığı üçün ikibaşlı* (z.) *da cavab verdi.* B.Bayramov.

◊ **İkibaşlı qartal** – çar Rusiyasının dövlət gerbi – üzərində qartalın iki baş şəklində təsviri (ümumiyyətlə çarlıq simvolu). *Fəqət məzlumlar qanına boyanmış ikibaşlı qartal çox davam edə bilməzdi.* H.Nəzərli. *..İkibaşlı qartal ilə "cümlə cahanı titrədən" imperiyanın sadiq nökəri Müqim bəy, rütbə etibarilə yüksəlmiş olsa belə, bu təzə qulluğunda nə zövq, nə də nəşə tapırdı.* S.Rəhimov. *Bu zamandan III İvan .. qədim Vizantiya dövlət nişanı olan ikibaşlı qartalı öz dövlətinin nişanı kimi qəbul edir.* M.İbrahimov. **İkibaşlı zərərə düşmək** – bir şeyin üstündə iki dəfə xərcə düşmək, iki dəfə pul xərcləməli olmaq.

**İKİBƏNDLİ** *sif. əd.* İki bənddən ibarət olan. *İkibəndli şeir.*

**İKİBƏTNLİLƏR** *is. zool.* Kisəli məməli heyvanlar ailəsindən kisəli siçanlar fəsiləsi.

**İKİBİR** *say.* İki-iki, cüt-cüt. *Yolçular çarəsiz qalıb nagah; İkibir, üçbir oldular həmrah.* H.Cavid. *Qocalar bir-birindən soruşur, ikibir, üçbir gəlir və torpaq şöbəsinə çıxırdılar.* S.Rəhimov. *İndi tez-tez sağsağan, qarğa, tək-tək, ikibir, üçbir uçuşan göyərçinlərə rast gəlirik.* M.Rzaquluzadə.

**İKİBOĞAZLI** *sif.* İki boğazı olan (b a x **boğaz**[1] 2-ci mənada). *İkiboğazlı şüşə.*

**İKİBUCAQLI** *sif.* İki bucağı olan.

**İKİBUYNUZ(LU)** b a x **qoşabuynuz(lu)**.

**İKİCANLI** *sif.* Hamilə, boyudolu. *İkicanlı qadın. – Getdin ora bircanlı, qayıtdın ikicanlı; Dərdin bir idi, indi min oldu, a zavallı.* M.Möcüz. ☐ **İkicanlı olmaq** – hamilə olmaq. *Ay keçdi, il keçdi bundan; İkicanlı oldu Gülyaz.* A.Şaiq. *Ağamehdi Tiflisdə iki il yaşadı, üçüncü ilə dönəndə qayınanası Xanpəri vəfat etdi, Gülnaz da ikicanlı oldu.* E.Sultanov. // Boğaz. *Yaz ağzı Molla bazardan bir ikicanlı keçi alır ki, südü ilə uşaqlarını dolandırsın.* "M.N.lətif."

**İKİCANLILIQ** *is.* Hamilə olma, boynunda uşaq olma; hamiləlik. // Boğazlıq.

**İKİCƏ** *say.* İki. *Əmrah ağzı üstə qapandı, yalnız ikicə dəfə hönkürdü.* M.Hüseyn. *Bayaqdan bəri* [Zərintac xanım] *cəmi ikicə dəst ürəyinə yatan paltar götürüb kənara tullaya bilmişdi.* S.Rəhimov. *Lakin ikicə gün sonra darülfünunda baş verən bir hadisə göstərdi ki, artıq onda bir xasiyyət olmuş bu qızğınlığı soyutmaq qeyri-mümkündür.* M.İbrahimov. // Yalnız iki, təkcə iki, ancaq iki. [Cəfərqulu] *bu dəfə ikicə gün qalıb qayıtdı.* Qantəmir. *İkicə tikə alandan sonra Cəlil bəy əlini dizlərinə silib dedi..* S.Rəhman. *Zeynalın verdiyi şəklə baxandan sonra Mülayim arvad ikicə günün içində şam kimi ərimişdi.* B.Bayramov.

**İKİCƏRGƏ** *zərf* İki cərgə halında. *İkicərgə oturmaq. Kitabları ikicərgə yığmaq.*

**İKİCƏRGƏLİ** *sif. k.t.* Cərgəsi iki olan, iki cərgədə, sırada düzülmüş, iki cərgədən ibarət. *İkicərgəli əkin. İkicərgəli çay bitkisi zolaqları.*

**İKİCƏRGƏLİLİK** *is.* İki cərgədən ibarət olma, iki cərgədə düzülmə.

**İKİCİLDLİ** *sif.* İki cilddən ibarət olan. *İkicildli lüğət. İkicildli əsər.*

**İKİCİLDLİK** 1. B a x **ikicildli**.

2. *is.* İki cilddən ibarət kitab. *Sabirin əsərlərinin ikicildliyi.*

**İKİCİNSİYYƏTLİ** *sif. biol.* Erkək və dişi cinsiyyət əlamətlərini özündə birləşdirən; xonsa. *İkicinsiyyətli orqanizm.* // *bot.* Bir çiçəkdə həm dişicik, həm də erkəkcik olan. *İkicinsiyyətli bitkilər.* // *zool.* Həm erkək, həm də dişi cinsi orqanları olan. *İkicinsiyyətli heyvanlar.*

**İKİCİNSİYYƏTLİLİK** *is. biol.* İkicinsiyyətli orqanizmin hal və keyfiyyəti.

**İKİCİNSLİ** b a x **ikicinsiyyətli**. *İkicinsli heyvanlar. İkicinsli bitkilər. – Turşəng fəsiləsi*(*nin*) *nümayəndələri otlardır; çiçəkləri müntəzəm, ikicinslidir.* M.Qasımov.

**İKİCİNSLİLİK** b a x **ikicinsiyyətlilik**.

**İKİÇARXLI** *sif.* Qoşa çarxı (təkəri) olan. [Zakir] *bir səhər ikiçarxlı arabasını götürüb həyətdə sürürdü.* H.Seyidbəyli.

**İKİÇƏYİRDƏKLİ** *sif.* İki çəyirdəyi olan. *İkiçəyirdəkli meyvə.*

**İKİÇİN** *zərf dan.* İkicərgə. *Ləməyə ikiçin əlvan zərli çini kasa və boşqab düzərdilər.* H.Sarabski.

**İKİDAYAQLI** *sif.* İki dayaq üzərində dayanan, iki dayağı olan. *İkidayaqlı dəzgah.*

**İKİDƏSTƏLİ** *sif.* İki dəstəsi, tutacağı olan, qulpu olan. *İkidəstəli mişar.*

**İKİDIRNAQLI** *zool.* b a x **qoşadırnaqlı**.

**İKİDİBLİ** *sif.* İki dibi olan. *İkidibli qab.*

**İKİDİLLİ** *sif.* 1. Eyni dərəcədə iki dildə danışan, məişətdə iki dildən istifadə edən. *İkidilli xalq.*

2. İki dildə tərtib edilmiş. *İkidilli lüğətlər.*

3. *məc.* Qeyri-səmimi, ikiüzlü, aldadıcı, yalançı. *Yaz günündə qar olmaz; Söyüd qalxar, bar olmaz; İkidilli gözəldə; Əhdə etibar olmaz.* (Bayatı). *Yox böylə ikidilli, yaman üzlü cəfakar; Bir zərrə utanmaz!* M.Ə.Sabir.

**İKİDİLLİLİK** *is.* 1. Eyni dərəcədə iki dilin işlənməsi. *Əhalinin ikidilliliyi.*

2. İki dili yaxşı bilmə və işlətmə.

**İKİDİŞLİ** *sif.* İki (bir cüt) dişi olan. *İkidişli yaba.*

**İKİDİŞLİLƏR** *cəm zool.* Okeanlarda yaşayan, əti zəhərli kirpiyə bənzəyən balıq.

**İKİDİVARLI** *sif.* İki divarı olan. *İkidivarlı kamera.*

**İKİDORLU** *sif. dəniz.* İki doru olan. *İkidorlu gəmi.*

**İKİDÜYMƏ(Lİ)** *sif.* 1. İki düymə ölçüsündə olan. *İkidüymə mıx. İkidüymə taxta.*

2. İki düyməsi olan. *İkidüyməli pencək.*

**İKİELEKTRODLU** *sif. fiz.* Hər iki ucunda elektrod olan, iki elektrodu olan. *İkielektrodlu keçirici.*

**İKİELEMENTLİ** *sif.* Tərkibi iki elementdən (ünsürdən) ibarət olan. *İkielementli maddə.*

**İKİEVCİKLİ** *is. bot.* İkievcikli bitkilər sinfinin adı.

**İKİEVCİKLİ** *sif. bot.* Erkək və dişi çiçəkləri müxtəlif fərdlərdə yerləşən (bitkilər haqqında). *Püstə .. ikievli bitkidir, yəni bir ağacda ancaq erkək, digər ağacda isə ancaq dişi çiçəkləri olur.* İ.Axundzadə.

**İKİEVLİ**[1] *sif. dan. köhn.* İki evi, arvadı, ailəsi olan. *İkievli kişi.* – [Zeynal] *tamamilə ikievli, ikiarvadlı idi.* S.Hüseyn.

**İKİEVLİ**[2] b a x **ikievcikli**.

**İKİEVLİLİK** *is. dan. köhn.* İkievli adamın hal və vəziyyəti.

**İKİƏLLİ** *zərf* Hər iki əllə, iki əlin iştirakı ilə, hər iki əlini işlədərək. *İkiəlli tutmaq. İkiəlli yığmaq.* – [Hacı Mehdi:] *Guya məni qalxızıb ikiəlli vurdular yerə.* Ə.Haqverdiyev. [Cəfər:] *Elə bunu deməyimi gördüm, anam başıma ikiəlli qapaz salıb, başladı məni qarğışlamağa.* E.Sultanov. [Aşıq Camal] *ikiəlli ustadının əlindən tutub dodaqlarına qaldırdı, hörmətlə qocanın əlini öpdü.* Ə.Məmmədxanlı.

**İKİƏRLİ** *sif.* Eyni zamanda iki əri olan.

**İKİƏRLİLİK** *is.* Eyni zamanda iki əri olma.

**İKİƏSRLİK** *sif.* İki əsr (iki yüz il) tarixi olan, iki əsr davam edən. *İkiəsrlik müstəmləkə. İkiəsrlik ayrılığın sonu gəldi.*

**İKİFAMİLİYALI** *sif.* İki familiyası olan, iki familiya daşıyan.

**İKİFAZALI** *sif. fiz.* İki fazası olan.

**İKİFİKİRLİ** *sif.* Müəyyən qərara gələ bilməyən, tez-tez fikrini dəyişən; mütərəddid. *İkifikirli adam.*

**İKİFİKİRLİLİK** *is.* Tez-tez fikrini dəyişmə, iki fikirdə olma.

**İKİGAVAHINLI** *sif.* İki gavahını olan. *İkigavahınlı kotan.*

**İKİGÖVDƏLİ** *sif. tex.* İki gövdəsi olan.

**İKİGÖYƏRTƏLİ** *sif. dəniz.* İki göyərtəsi olan. *İkigöyərtəli gəmi.*

**İKİGÖZLÜ** *sif.* İki gözü olan, iki hissədən ibarət. *İkigözlü miz. İkigözlü qutu. İkigözlü dükan.*

**İKİGÜNLÜK** *sif.* 1. İki gün vaxt tələb edən. *İkigünlük iş qalıb.* // İki gün sürən, iki gün davam edən. *İkigünlük möhlət. İkigünlük səyahət.* // İki günə çatan, iki gün üçün kifayət edən. *İkigünlük azuqə.*

2. Doğulmasından iki gün keçmiş. *İkigünlük uşaq.*

**İKİGÜVƏNLİ** b a x **ikihürgüclü.**

**İKİGÜZGÜLÜ** *sif.* İki güzgüsü olan. *İkigüzgülü şifoner.*

**İKİHAÇA(LI)** *sif.* və *zərf* İki haçası olan, iki yerə ayrılan. □ **İkihaça(lı) olmaq** – şaqqalanmaq, iki qola ayrılmaq. *Bir cida boyu qalxmış günəş çayın ikihaçalı olub axan sularında çimir, dağdan əsən sərin külək qızların saçları ilə oynayırdı.* S.Rəhman.

**İKİHAKİMİYYƏTLİLİK** *is.* Bir ölkədə eyni zamanda iki hakimiyyətin olduğu vəziyyət.

**İKİHECALI** *sif. dilç.* İki hecadan ibarət. *İkihecalı söz.*

**İKİHƏDLİ** *sif. riyaz.* İki həddi olan, iki həddən ibarət olan.

**İKİHƏFTƏLİK** *sif.* İki həftə davam edən, iki həftə müddətinə. *İkihəftəlik məzuniyyət. İkihəftəlik maaş.*

**İKİHƏRƏKƏTLİLƏR** *is. zool.* Yer altında yaşayan qurda bənzər kərtənkələ fəsiləsi.

**İKİHİSSƏLİ** *sif.* İki hissədən ibarət olan. *İkihissəli əsər.*

**İKİHÖKUMƏTLİLİK** b a x **ikihakimiyyətlilik**.

**İKİHÜRGÜCLÜ** *sif.* İki hürgücü (güvəni) olan. *İkihürgüclü dəvə.*

**İKİXƏTLİ** *sif.* Qoşaxətli, qoşa cızıqları olan. *İkixətli dəftər.*

**İKİİLÇİ** *is.* Bir sinifdə iki il oxuyan. *İkiilçi şagird.*

**İKİİLLİK** *sif.* 1. İki il davam edən və ya davam etmiş. *İkiillik kurs. İkiillik ezamiyyət. İkiillik dövr. İkiillik səfər.*

2. Yaşı iki il olan, iki yaşında olan; ikiyaşar. *İkiillik dana.*

3. *bot.* Tam inkişafı (cücərməyə başlamaqdan toxumlarının yetişməsinə qədər) iki vegetasiya dövrü tələb edən və toxumları yetişdikdən sonra məhv olan. *İkiillik bitkilər.*

**İKİKAMERALI** *sif. tex.* İki kamerası olan. *İkikameralı soba.*

**İKİKANALLI** *sif. rad.* İki kanalda işləyən, iki kanalda veriliş verən, yaxud iki kanalda verilən televiziya verilişlərini qəbul edən.

**İKİKƏSİCİDİŞLİLƏR** *is. zool.* Avstraliyada yaşayan kisəli heyvanlar dəstəsi.

**İKİKİLOQRAMLIQ** 1. *sif.* İki kiloqram ağırlığında olan, iki kiloqram tutan.

2. *İs. mənasında.* İki kiloqram ağırlığında olan çəki daşı.

**İKİKİLOMETRLİK** *sif.* 1. İki kilometr uzunluğunda olan, məsafəsi iki kilometr olan. *İkikilometrlik yol.*

2. *coğr.* Santimetrdə iki kilometr miqyası olan. *İkikilometrlik xəritə.*

**İKİKONUSLU** *sif.* İki konusu olan.

**İKİQANADLI** *sif.* Bir cüt qanadı olan, iki qanadı olan; qoşaqanadlı. *İkiqanadlı təyyarə.*

**İKİQANADLILAR** *is. zool.* Bir cüt qanadı olan həşərat dəstəsi; qoşaqanadlılar, cütqanadlılar. *Mozalanlar ikiqanadlılar dəstəsinə mənsubdur.*

**İKİQAPAQLI** *is. zool.* Üst qabığı iki qapaq şəklində olan molyusk.

**İKİQAT** 1. *sif.* Bir-birinə uyğun, yaxud yekcins iki hissədən ibarət. *İkiqat parça. İkiqat pəncərə.* – [Şahsənəm xala] *çadrasını ikiqat eləyib atdı başına..* E.Sultanov. *Sərəncam bacı başında ikiqat çarşab oğlunu dolandırıb gəzdirirdi..* Çəmənzəminli. *Çamadanın dibi ikiqat idi.* S.Rəhman.

2. *zərf* İki dəfə çox, iki dəfə artıq. [Hacı Fərəc:] *..Təzə müştərilər çıxıb, ikiqat qiymət verməyə hazırdırlar..* N.Vəzirov. *Bu göyərçin mənim üçün ikiqat əzizdir..* M.Rzaquluzadə.

◊ **İkiqat etmək** – bir şeyi bir-birinə uyğun tərzdə qatlamaq, bükmək. *Kəlağayını ikiqat edib başına örtdü.* – [Cəfərqulu] *başından papağını çıxardıb ikiqat edəndən sonra alnının tərini sildi və bu cür sözə başladı.* Qantəmir. **İkiqat olmaq (əyilmək, bükülmək)** – 1) təzim etmək, əyilərək salam vermək. *İkiqat olub ədəblə bəyə baş vurardı kasıb; Var idi vəfalı kasıb, var idi həyalı fələ!* M.Ə.Sabir; 2) yaltaqlanmaq, alçalmaq, baş əymək. *Havaxtadək olacağıq ikiqat.* Q.Zakir. [Ramazan:] *İndi elə vaxt deyil ki, buruq ustası olmaq üçün otuz-qırx il külüng çalasan, onun-bunun qabağında ikiqat əyiləsən.* M.Hüseyn; 3) əyilmək, bükülmək, belini əymək. *Mahmud əmi ikiqat bükülüb bir neçə dəfə başını gah daşın bu böyrünə, gah o böyrünə sallayıb diqqətlə haman nöqtəyə baxırdı.* B.Talıblı.

**İKİQATLI** *sif.* 1. İki qatdan ibarət olan. *İkiqatlı parça. İkiqatlı sap.*

2. İki mərtəbəsi olan, ikimərtəbəli. *İkiqatlı bina.* – *Qarşıda ikiqatlı bir ev görünürdü.* S.Hüseyn.

**İKİQƏLSƏMƏLİLƏR** *is. zool.* Bir cüt qəlsəməsi olan başayaqlı molyusklar yarımsinifinin adı.

**İKİQƏPİKLİK** *is.* İki qəpik dəyərində olan metal pul.

**İKİQIÇLI** b a x **ikiayaqlı**.

**İKİQİYMƏTLİ** b a x **ikirəqəmli**.

**İKİQOLLU** *sif.* İki qolu olan (b a x **qol**[1] 5-ci mənada). *İkiqollu çay.*

**İKİQULPLU** *sif.* İki qulpu (dəstəsi) olan. *İkiqulplu qab. İkiqulplu qazan.*

**İKİLAMPALI** *sif.* İki lampası olan, iki lampa ilə işləyən. *İkilampalı radio aparatı.*

**İKİLAYLI** *sif.* 1. İki laydan (qatdan, təbəqədən) ibarət olan.

2. B a x **ikitaylı**. *İkilaylı qapı.*

**İKİLƏÇƏKLİ** *sif. bot.* İki ləçəyi olan. *İkiləçəkli çiçək.*

**İKİLƏMƏ** 1. "İkiləmək"dən *f.is.*

2. *k.t.* İki dəfə əkilmiş eyni yer. *İkiləmə əkin.*

**İKİLƏMƏK** *f.* 1. Bir şeyi, bir məsələni iki hissəyə bölmək.

2. İki eləmək, qoşalaşdırmaq, cütləşdirmək, bir şeyin üstünə birini də artırmaq. *Ay qız, gözün aydın, ikiləmisən ki, adı nədir?* Mir Cəlal. // Bir işi iki yol görmək.

**İKİLƏNMƏ** "İkilənmək"dən *f.is.*

**İKİLƏNMƏK** 1. *məch.* İki edilmək, qoşalandırılmaq, bir şeyin üstünə biri də əlavə edilmək.

2. B a x **ikiləşmək**.

**İKİLƏPƏLİ** *sif. bot.* İki ləpəsi olan. *İkiləpəli bitkilər.*

**İKİLƏPƏLİLƏR** *is. bot.* Toxumu iki ləpədən ibarət olan bitkilər fəsiləsinin adı.

**İKİLƏTMƏ** "İkilətmək"dən *f.is.*

**İKİLƏTMƏK** *f.* Sayını iki eləmək; cütləşdirmək. *Paltarı ikilətmək.*

**İKİLƏŞDİRMƏ** "İkiləşdirmək"dən *f.is.*

**İKİLƏŞDİRMƏK** b a x **ikilətmək**.

**İKİLƏŞMƏ** "İkiləşmək"dən *f.is.*

**İKİLƏŞMƏK** *f.* 1. İki olmaq, bir cut olmaq; qoşalaşmaq. *Qızlar ikiləşib getdilər.*

2. İki yerə ayrılmaq, şaqqalanmaq. // *məc.* İki cür olmaq, iki tərəfə meyil etmək, bütövlüyünü itirmək, ziddiyyətli olmaq.

**İKİLİ** *zərf* 1. İkisi bir yerdə, ikilikdə. *İkili yaşamaq. İkili getmək.* – [Zeynalın] *fikrində vardı ki, əvvəlcə bu ayrılmaq məsələsini, soyuqqanlılıqla bir yerdə ikili qonuşub, çocuqlarının müqəddəratını öz aralarında həll etsinlər.* S.Hüseyn.

2. Çox vaxt bir-birinə zidd iki müxtəlif keyfiyyəti ehtiva edən; ziddiyyətli.

**İKİLİBAŞLI** *zərf dan.* Əvvəl-axır, gec-tez, nə cür olursa olsun, hər halda, necə olsa, mütləq. *İkilibaşlı bu işi görməlisən.*

**İKİLİK** 1. *sif.* İki rəqəmi ilə işarə olunan, nömrələnən, ölçülən və s. *İkilik taxta. İkilik mıx.*

2. *is.* İki xalı olan oyun kağızı. *İkilik atmaq. Xaç ikilik.*

3. *is.* İkitirəlik, ziddiyyət. *Bu aralıq həyatda bir ikilik törənmişdi.* C.Cabbarlı. [Kəbusey:] *Zərdüştilər yaradılışda ikilik olduğuna inanırlar.* Çəmənzəminli.

4. *is.* İkitərəflilik, iki tərəfə meyil.

**İKİLİKDƏ** *zərf* İkisi bir yerdə, iki nəfər birlikdə, üçüncü şəxsin iştirakı olmadan. *Məsələni ikilikdə danışarıq. – Heç vaxt* [Bəşir sözündən] *qaça bilməz, burada ikilikdə qət etmişik.* S.S.Axundov. *Onları ikilikdə buraxsan, bülbül kimi dil açıb ürək dastanlarını, kim bilir, necə mənalı və dadlı sözlərlə danışardılar.* Mir Cəlal. *..Teymurla Güldəstə ikilikdə qalmışdılar.* H.Seyidbəyli.

**İKİLİTRLİK** *sif.* İki litr ağırlığında olan, iki litr tutan. *İkilitrlik qab.*

**İKİLÜLƏ(Lİ)** *sif.* İki lüləsi olan; qoşalülə. *İkilüləli tüfəng.*

**İKİMANATLIQ** *sif.* İki manata dəyən, iki manat qiymətində olan. *İkimanatlıq parça. İkimanatlıq vaz.*

**İKİMETRLİK** *sif.* İki metr uzunluğunda olan. *İkimetrlik taxta.*

**İKİMƏHSULLU** *sif. k.t.* İldə iki dəfə məhsul verən. *İkiməhsullu bitkilər.*

**İKİMƏNALI** *sif.* 1. *dilç.* İki mənası olan, iki məna verən. *İkimənalı söz. İkimənalı ifadə.*

2. Eyhamlı, üstüörtülü, pərdəli, iki cür başa düşülə bilən. *Pərdəli, ikimənalı danışıqlardan da xoşum gəlməz.* Ə.Vəliyev.

**İKİMƏNALILIQ** *is.* İki mənaya malik olma. *Sözün* (*ifadənin*) *ikimənalılığı.*

**İKİMƏNZİLLİ** *sif.* İki mənzildən ibarət olan. *İkimənzilli ev.*

**İKİMƏRTƏBƏ(Lİ)** *sif.* İki mərtəbəsi olan, ikiqat(lı). *Ağamehdinin mülkü gözəl mülklərdən birisi idi: içində ikimərtəbəli imarət, aynabənd otaqlar, fəvvarəli hovuzlar, cənnət guşəsi kimi böyük bir bağça..* E.Sultanov. *İkimərtəbə, qəşəng bir evin qapısını qorxa-qorxa döydülər.* S.Rəhman.

**İKİMİL(Lİ)** *sif.* İki mili olan. *İkimilli dəftər, kağız.*

**İKİMOTORLU** *sif.* İki motoru olan, iki motorla işləyən. *İkimotorlu təyyarə.*

**İKİNCİ** *sıra s.* 1. Birincidən sonra gələn. *İkinci sinif. İkinci cərgə. Kitabın ikinci cildi.* – [Qəhrəman:] *İkinci gün şəhərdə olduqca şiddətli bir vuruşma gedirdi.* H.Nəzərli. *Birinci addımda lovğalananlar; İkinci addımda yıxılacaqdır.* S.Vurğun.

2. Keyfiyyətcə birincidən aşağı. *İkinci növ çay. İkinci dərəcəli kayut. İkinci dərəcəli mal.*

3. Ən əsas (ən mühüm, ən vacib) hesab edilməyən. *İkinci planda duran məsələ. O biri məsələlər ikinci plana keçirildi.* // Əsas olmayan, köməkçi partiyanı ifa edən. *İkinci skripka. İkinci rollarda çıxış etmək.*

4. Əsası, birincini əvəz edən. *İkinci vətən. – İkinci atamın icazəsi ilə rus dilini öyrənmək üçün bu məktəbə girib, bir il burada təlim alıb çıxdım.* F.Köçərli. *Ögey saymayırdı əsla özünü; Sevirdi ikinci anasını da.* M.Rahim.

**İKİNCİLİK** *is.* İkinci yeri tutma, ikinci yerdə olma. *Gülşən bilirdi ki, bildir rayon yarışlarında Qəmər yüyürməkdə birincilik, tullanmaqda ikincilik qazanmışdır.* Ə.Vəliyev.

**İKİNCİSİZ** *sif.* İkincisi olmayan, əvəzsiz, tayı, bərabəri olmayan. [Xaspolad:] [Oqtay] *Azərbaycan səhnəsinin doğma anası olan ikincisiz böyük bir sənətkar, sarsılmaz, fədakar bir sənət mübarizidir.* C.Cabbarlı.

**İKİNDİ** *zərf* Günün günorta ilə axşam arasındakı ikinci yarısı, günbatana yaxın hissəsi. *İkindi çağı idi. Obada “Dursunu ayı basmış”, – deyə səs qopdu.* A.Şaiq. *Səfalı atlıları kənddən çıxanda ikindi vaxtı idi.* T.Ş.Simurq.

**İKİNƏFƏRLİK** b a x **ikiadamlıq**.

**İKİNÖVBƏLİ** *sif.* İki növbədə görülən, iki növbəsi olan. *İkinövbəli iş.*

**İKİOXLU** *sif. xüs.* İki oxu olan. *İkioxlu maşın. İkioxlu yük avtomobili.*

**İKİOTAQLI** *sif.* İki otaqdan ibarət. *İkiotaqlı mənzil. – ..*[Tahir] *ikiotaqlı təzə mənzilində cəmisi bir həftə qalmışdı.* M.Hüseyn. [Həsrət:] *Nəcəfalı əmi, güman eləyirəm ki, yaza qədər həkim məntəqəsi üçün ikiotaqlı bir bina tikə bilərik.* B.Bayramov.

**İKİÖLÇÜLÜ** *sif. xüs.* İki ölçü ilə təyin edilən.

**İKİÖVRƏTLİ** *köhn.* bax **ikiarvadlı**.

**İKİÖVRƏTLİLİK** *köhn.* bax **ikiarvadlılıq**. [Hacı Mehdi:] *A kişi, bu ikiövrətlilik qəribə yaman şey imiş.* Ə.Haqverdiyev.

**İKİPALATALI** *sif.* İki qanunverici palatadan ibarət olan. *İkipalatalı parlament.*

**İKİPARTİYALI** *sif.* İki partiyası olan. ☐ **İkipartiyalı sistem** – ölkədə inhisarçı kapitalın, hakimiyyət başında bir-birini əvəz edən iki partiyanın mövcud olması.

**İKİPARTİYALILIQ** *is.* Hökumət başında bir-birini əvəz edən iki siyasi partiyanın mövcud olduğu sistem.

**İKİPƏNCƏRƏLİ** *sif.* İki pəncərəsi olan. *İkipəncərəli otaq.*

**İKİPƏRDƏLİ** *sif.* İki hissədən, iki pərdədən ibarət olan. *İkipərdəli pyes.*

**İKİPƏRLİ** *sif.* İki pəri olan. *İkipərli üzgəc* (balıqda).

**İKİPİLLƏLİ** *sif.* İki pilləsi olan. *İkipilləli pilləkən.*

**İKİPLANLI** *sif.* İki tərəfi, iki planı olan; iki planda yerləşmiş. *İkiplanlı şəkil.*

**İKİPRİZMALI** *sif. riyaz.* Daxilində iki prizma olan. *İkiprizmalı cihaz.*

**İKİPUDLUQ** *sif. köhn.* İki pud ağırlığında olan. *İkipudluq daş. İkipudluq yük.* // İki pud tutan. *İkipudluq kisə.* // *İs. mənasında.* İki pud ağırlığında olan daş.

**İKİRƏQƏMLİ** *sif. riyaz.* Rəqəmi iki olan. *İkirəqəmli say.*

**İKİRƏNG(Lİ)** *sif.* İki rəngi olan, iki rəngdə boyadılmış; iki rəng verən, iki rəngə çalan. *İkirəngli fincan. İkirəngli parça.*

**İKİRƏNGLİLİK** *is.* İki rəngdə olma, ikirəngli şeyin halı.

**İKİSAATLIQ** *sif.* İki saat davam edən və ya davam etmiş, iki saat üçün müəyyən edilmiş; iki saat vaxt tələb edən. *İkisaatlıq iş. İkisaatlıq yol. İkisaatlıq tənəffüs.*

**İKİSAPLI** *sif.* İki dəstəsi, iki əl yerisi olan. *İkisaplı mişar.*

**İKİSƏSLİ** *sif. mus.* İki səsdə oxunan, iki səs üçün yazılmış. *İkisəsli nəğmə. İkisəsli xor.*

**İKİSƏTİRLİK** *sif.* İki sətirdən ibarət. *İkisətirlik yazı.*

**İKİSİLİNDRLİ** *sif. xüs.* İki silindri olan. *İkisilindrli maşın.*

**İKİSİMLİ** *sif. mus.* İki simi olan (çalğı aləti).

**İKİSİNİFLİ** *sif. köhn.* İki sinfi olan. *İkisinifli ibtidai məktəb.*

**İKİSORMACLILAR** *is. zool.* Yastı qurdlar dəstəsi.

**İKİŞAHILIQ** *is.* 10 qəpiklik sikkə (pul).

**İKİŞƏKİLLİ** *sif.* İki şəkli olan. *İkişəkilli pyes.*

**İKİŞƏR** *say.* İki-iki, cüt-cüt, qoşa-qoşa. *Otağın divarları uzunu düzülmüş taxta pillələrdə ikişər cərgə oturmuş şagirdlərdən, yuxarı pillədəkiləri kitab, aşağıda oturanları "Çərəkə" oxuyan idilər.* T.Ş.Simurq. // Hər birinə və ya hər dəfəsində iki. *Hərəsinə ikişər manat düşdü.*

**ikişər-ikişər** *zərf* İki-iki, cüt-cüt, qoşa-qoşa. *Bu sırada mürəttiblər birər-birər, ikişər-ikişər, kirli iş əlbisəsində daxil olurlar.* H.Cavid.

**İKİTAĞLI** *sif.* İki tağı olan, iki tağdan ibarət. *Qarşıdakı ikitağlı böyük pəncərədən gur işıq içəri dolurdu.* M.İbrahimov.

**İKİTAXTA¹** *sif. köhn.* İki taxtadan ibarət. *İkitaxta tuman. İkitaxta yorğanüzü.*

**İKİTAXTA²** *sif.* İki pillədən ibarət; ikipilləli. *İçəri girən kimi enli ikitaxta pilləkən qəşəngliyi, təmizliyi və zərifliyi ilə nəzəri cəlb edirdi.* Ə.Vəliyev.

**İKİTAKTLI** *sif. mus.* İki takt davam edən, iki takta uyğun olan. *İkitaktlı pauza.*

**İKİTARLALI** *sif. k.t.* İkitarlalıq üsulu ilə bağlı olan. *İkitarlalı əkin sistemi. İkitarlalı təsərrüfat.*

**İKİTARLALIQ** *is. k.t.* Hər il torpağın yarısını heriyə qoymaq qaydası ilə aparılan torpağı becərmə üsulu.

**İKİTAYLI** *sif.* İki tərəfli (laylı), iki tayı olan. *İkitaylı darvaza. İkitaylı pəncərə. – Ziyafət salonunun böyük və ikitaylı qapısı birdən açıldı.* M.S.Ordubadi.

**İKİTELLİ** bax **ikisimli**.

**İKİTƏBƏQƏLİ** *sif.* İki qatdan, iki təbəqədən, iki laydan ibarət olan. *İkitəbəqəli torpaq.*

**İKİTƏBƏQƏLİLİK** *is.* İkitəbəqəli şeyin hal və keyfiyyəti.

**İKİTƏKƏRLİ** bax **ikiçarxlı**.

**İKİTƏNƏFFÜSLÜLƏR** *is. zool.* Həm qəlsəmələri, həm də ciyərləri ilə tənəffüs edən balıqlar dəstəsi.

**İKİTƏRƏFLİ** *sif.* 1. İki tərəfi olan. *İkitərəfli cisim. İkitərəfli qapı.*

2. İki istiqamətdə gedən, iki tərəfdən baş verən. *İkitərəfli küçə hərəkəti. İkitərəfli top atəşi. İkitərəfli sətəlcəm. – Kişinin məhəbbəti tamamilə ona keçdi, Fatma bilmərrə nəzərdən düşdü, hər gün ikitərəfli* (z.) *döyülüb söyüldü.* Çəmənzəminli. *Bütün yollar ikitərəflidir, həm qabağa gedir, həm də dala qayıdır.* M.İbrahimov. // Hər iki tərəfə işləyən, hərəkət edən, fəaliyyət göstərən. *İkitərəfli rabitə xətti.*

3. Hər iki tərəfin razılığı ilə olan, hər iki tərəf üçün məcburi olan; qarşılıqlı. *İkitərəfli müqavilə. İkitərəfli saziş.*

4. İki tərəfə, iki yana. [Musanın nəvəsi] *başını ikitərəfli* (z.) *daradı, belini düymələdi.* Qantəmir.

5. B a x **ikibaşlı** 1 və 3-cü mənalarda.

**İKİTƏRKİBLİ** *sif.* Tərkibi iki ünsürdən ibarət olan, cüttərkibli. *İkitərkibli cümlə.*

**İKİTİRƏLİK** *is.* Bir-birinə zidd iki dəstəyə ayrılma; təfriqə, nifaq, çəkişmə. ☐ **İkitirəlik düşmək** – nifaq düşmək, arasında ədavət düşmək. *O, araya ikitirəlik düşə biləcəyindən qorxurdu. İkitirəliyə lap tezliklə son qoymaq olardı.* **İkitirəlik salmaq** – nifaq salmaq, təfriqə salmaq, ziddiyyət yaratmaq, araya ədavət salmaq. *Eyni zamanda bu məsələnin İran demokratları arasında ikitirəlik salmaq qorxusu da vardır.* M.S.Ordubadi. [Allahverdi:] *İkitirəlik salıblar, nə o yandan bu yana bir adam keçə bilir, nə bu yandan o yana.* C.Cabbarlı. *Kəndə ikitirəlik salıb; Pirəli etdi; İstəyincə paşalıq.* M.Rahim.

**İKİTOXUMLULAR** b a x **ikiləpəlilər**.

**İKİTONLUQ** *sif.* 1. İki ton ağırlığında şey tutan. *İkitonluq yük maşını.*

2. İki ton ağırlığında olan. *İkitonluq yük. – Misirli qardaş addımladı; Çiynində Xeops ehramının ikitonluq daşı.* O.Sarıvəlli.

**İKİ-ÜÇ** *say.* Bir neçə, iki və ya üç. *İki-üç arşın dərində geniş bir qazma idi.* H.Nəzərli. *Alaçıqların yanında dizlik geymiş, belinə şal bağlamış iki-üç qadın tərpənirdi.* M.İbrahimov. *Qalın duman ətrafı elə bürümüşdü ki, iki-üç addımlıqda göz-gözü görmürdü.* Ə.Vəliyev.

**İKİÜZLÜ**[1] *sif.* 1. Üzü ilə astarının rəngi, naxışı və s. bir cür olan, hər iki üzü, hər iki tərəfi bir cür olan. *İkiüzlü parça. – Ağ çuxalı, ağ arxalıqlı, ikiüzlü Buxara dərisindən papaqlı, şişman göbəyi üzərində gümüş kəmərli Mirzə Səfəri hamı tanıyırdı.* Ə.Haqverdiyev.

2. *tex.* İkiyanlı, ikisəthli. *İkiüzlü cisim.*

**İKİÜZLÜ**[2] *sif.* Üzdə bir cür, dalda başqa cür danışan, hərəkət edən; riyakar, qeyri-səmimi. *İkiüzlü adam. – Siz bağışlayın, yoldaş Mədəd, bu Tanrıverdi xalis ikiüzlüdür.* S.Rəhimov. [Səmirə:] *Mənim kimi bir qadın hesabla gərək Səidə xanıma nifrət edəydi, onu ikiüzlü sayaydı.* M.Hüseyn. // İs. mənasında. *İkiüzlünün biridir. – İfşa edildikcə ikiüzlülər; Dünya al geyinib toybayram eylər.* M Rahim.

**İKİÜZLÜLÜK** *is.* Özünü üzdə bir cür, dalda isə başqa cür göstərmə; riya, riyakarlıq. *İkiüzlülük etmək. – Dünyada saxtalığı, ikiüzlülüyü, riyanı və hiyləni sevməyən təmiz və səmimi bir şey varsa, o da sevgidir.* M.S.Ordubadi. [Rəşid:] *Fikirləşdim ki, bax bu dəqiqə başını qaldırıb hər iki tərəfə xidmət göstərən Bəkiri ikiüzlülükdə və fırıldaqçılıqda təqsirləndirə bilər.* İ.Hüseynov.

**İKİÜZVLÜ** b a x **ikihədli**.

**İKİVALENTLİ** *sif. kim.* İki valentdən ibarət olan.

**İKİVERSTLİK** *sif.* 1. İki verst uzunluğunda olan. *İkiverstlik məsafə. İkiverstlik yol.*

2. İki verst miqyaslı. *İkiverstlik xəritə.*

**İKİYANLI** *sif.* İki yanı olan.

**İKİYARUSLU** *sif.* İki yarusu olan. *İkiyaruslu teatr zalı.*

**İKİYAŞAR** *sif.* İki yaşında olan, ikiyaşlı. *İkiyaşar dana. – Qulanlar böyüyüb ikiyaşar* (z.) *olmuşdular.* "Koroğlu".

**İKİYAŞLI** b a x **ikiyaşar**.

**İKİYERLİ** b a x **ikiadamlıq**.

**İKİZİRVƏLİ** *sif.* İki zirvəsi (təpəsi, başı) olan.

**İKMAL** *is.* [*ər.*] Tamamlama, bitirmə, qurtarma, mükəmməlləşdirmə. *Darülədəbin bilməliyiz qədrini, millət! İkmalına göstərməli olduqca həmiyyət.* M.Hadi. *Bu gənc yeddi il idi ki, Parisdə tibb fakültəsini ikmal üçün sevgili vətənindən ayrı düşmüşdü.* S.S.Axundov. ☐ **İkmal etmək** – tamamla-

maq, axıra çatdırmaq, bitirmək, qurtarmaq. *Təlim və tədris ana dilində icra olunan məktəbi-ibtidaini ikmal etdikdən sonra, şagirdi rus edadiyyələrinə, yəni gimnaziyaya, realni* [məktəblərə] *təbiidir ki, qəbul etməzlər.* Ü.Hacıbəyov. [Varis:] *..Mən varlı olduğum halda, orta məktəbi ikmal edib bu şapkanı qoya bilmədim.* A.Şaiq. **İkmala yetirmək** – b a x **ikmal etmək**.

**İKÓNA** [*yunancadan*] Xristianlarda: Allahın, yaxud övliyaların şəkli.

**İKRAH** *is.* [*ər.*] İyrənmə, çimçişmə, diksinmə, nifrət. *Bu bədheybət adam xanın gözünə sataşdıqda sanki xanda ona qarşı bir ikrah hissi əmələ gəldi.* Çəmənzəminli. *O, üz-gözünə boya vuranda və səliqəli geyinəndə, sədrinə xoş gəldiyini bilsə də, ürəyində çoxdan bəri ona qarşı qüvvətli bir ikrah hissi duyur.* M.Hüseyn. // İyrəndirmə, nifrətləndirmə. [Şeyx Sədra:] *Xayır, artıq bu pək fəna təhqir; Səni ikrah üçün bu bir tədbir..* H.Cavid. □ **İkrah etdirmək** – iyrəndirmək, çimçişdirmək, diksindirmək, nifrət oyatmaq. [Sevda:] *Çirkinliyim etdirməsin ikrah; Könlüm səni öpmək dilər.* H.Cavid. **İkrah etmək (eyləmək, olmaq, qılmaq)** – iyrənmək, nifrət etmək, zəhləsi getmək. *Zahida, sən fariq ol, ahimdən ikrah eyləmə; Kim, mənim bağrımda çoxdur qəmzələrdən yarələr.* Xətayi. *Gəz bir neçə gün mənimlə həmrah; İnsan deyib etmə məndən ikrah.* Füzuli. *Xah yüz döndərsən ondan, xah ikrah eyləsən; Axır, ey əbrukaman, Qövsi sənə qurban olur.* Qövsi. **İkraha gəlmək** – b a x **ikrah etmək**. *..Bu hadiseyi-əlimənin dəhşəti bütün aləmə əsər etdi, hamı nifrət və ikraha gəldi.* Ü.Hacıbəyov.

**İKRAM** *is.* [*ər.*] Hörmət, sayğı, əzizləmə, ehtiram, hörmət göstərmə. *Xalqın işi bizlərə ikram idi; Ax, necə kef çəkməli əyyam idi.* M.Ə.Sabir. *O, Hicazdan dönüb keçən axşam; Vardı Bağdadə, gördü çox ikram.* H.Cavid. □ **İkram etmək (qılmaq)** – hörmət etmək, sayğı göstərmək, əzizləmək, ehtiram etmək. *Tuba görsə ikram eylər, baş əyər; Bu gözəl boy ilən, ilən sənə!* M.P.Vaqif. *İkram edər ol gül mənə əğyar yanında; Ta etsin özünü sevgili hər xar yanında.* S.Ə.Şirvani.

**İKS** *is.* 1. Latın əlifbasının iyirmi dördüncü hərfi (×).

2. *riyaz.* Məlum olmayan və "×" hərfi ilə işarə olunan kəmiyyət.

3. *məc.* Məlum olmayan və ya adı çəkilmək istənilməyən şəxsə işarə.

**İKSİR** *is.* [*ər.* əsli *yun.*] Vaxtilə yalançı kimyagərlərin xariqüladə bir qüvvə və təsirə malik olduğunu zənn etdikləri mövhum bir maddə. [Hacı Kərim:] [Molla İbrahimxəlil kimyagər] *məsələn, bir zad dürüst edibdir ki, adına iksir deyirlər. Bir misqal ondan bir batman misə vurur, xalis gümüş olur.* M.F.Axundzadə. *Halbuki ağalar bütün ömrlərini buna sərf edirlər ki, iksir vasitəsilə bir şeyi döndərib özgə bir şey eləsinlər.* C.Məmmədquluzadə. [Xortdan:] *..Mirzə Qoşunəli Təbrizi adında bir möhtərəm şəxs iksir qayırmaqla məşğuldur.* Ə.Haqverdiyev. // *məc*. Əlac, dava mənasında.

◊ **Həyat iksiri** – insanın ömrünü uzatmaq, cavanlığını mühafizə etmək üçün qədim kimyagərlərin tapmaq istədiyi sehrli içki.

**İKTİFA** *is.* [*ər.*] Kifayətlənmə, qane olma. □ **İktifa etmək (eləmək)** – 1) kifayətlənmək, qane olmaq. [Hatəmxan ağa:] *Niyə başa düşmədin, balam, çox arvad almaq ibarətdir ondan ki, bir kişi bir arvada iktifa etməsin.* M.F.Axundzadə. [Rüstəm bəy:] [Nemət] *cəld geyinib, bir stəkan çay ilə iktifa edib evdən çıxdı.* Çəmənzəminli. *Kim bilir ki, Tükəzban bununla iktifa eləməyib, nərdivanın yuxarı pillələrinə dırmaşmaq niyyətinə düşəcək.* B.Talıblı; 2) kifayət etmək, bəs olmaq. *Yoxsa ki, etməz quru söz iktifa; İş gərək olsun, nə əbəs iddia.* A.Səhhət.

**İQAMƏT** *is.* [*ər.*] Sakin olma, oturma, bir yerdə yaşamaq üçün qalma, qərar tutma. *Mümkün degil, Füzuli, cahanda iqamətin; Bihudə sən bu mərhələdə məskən eylədin.* Füzuli. *O, Azərbaycanın Danaqırt qəsəbəsində təvəllüd edib, doqquz yaşa qədər orda iqamətlə, sonralar Bağdada müvasilət etmişdi.* C.Məmmədquluzadə. □ **İqamət etmək** – bir yerdə sakin olmaq, məskən salmaq, qərar tutmaq, oturmaq. *Həmin günün axşamı Tiflisdə iqamət edən Zaqafqaziyanın şeyxülislamı rus dilində bu məzmunda bir teleqram aldı.* E.Sultanov. ..[Mehriban] *Ağ-*

*damda iqamət edən atasına teleqraf çəkdirib, onu Bakıya çağırmaqla çocuqlarının məsələsini həll edəcəkdi.* S.Hüseyn.

**İQAMƏTGAH** *is.* [*ər.* iqamət və *fars.* ...gah] İqamət yeri, oturulan yer, məskən. [Ata:] *Müqəddəs qanuna görə iqamətgahı kim verəcək?* Çəmənzəminli. // Hökumət və ya dövlət başçısının, habelə yüksək vəzifə sahibi olan şəxslərin sakin olduqları yer. *Prezidentin iqamətgahı.* – [İbni-Salam:] *Durmayıb birbaş mənim iqamətgahıma çapın.* Ə.Məmmədxanlı.

**İQBAL** *is.* [*ər.*] Bəxt, tale; bəxti gətirmə. *Sənsən mənim ayım, günüm, hilalım; Dövlətim, iqbalım, cahım, cəlalım.* M.P.Vaqif. *Tam iki aydır ki, tale, iqbal, ümid .. hər şey, məncə, məhv olub bitmiş..* H.Cavid. *Gah onun, gah bunun üzünə güldü iqbal.* B.Vahabzadə. ☐ **İqbalı dönmək** – bəxti gətirməmək; bəxti, taleyi dönmək. *Həmdülillah, dönüb iqbalı bizim tazələrin; Qarışıb yenə əhvalı bizim tazələrin.* Ə.Nəzmi. **İqbalı gətirmək** – bəxti gətirmək. [Bayram:] *Ümid yoxdur, iqbalım gətirməyəcək, Zalxa etdiyi vədəni bitirməyə cürət edə bilməyəcək.* M.F.Axundzadə.

**İQDAM** *is.* [*ər.*] Bir işə səbatla təşəbbüs etmə, başlama. ☐ **İqdam etmək** – təşəbbüs etmək, başlamaq, girişmək. [Ağa Salman:] *Xanım, mən məhz sənin xatirin üçün bu işə iqdam edirəm.* M.F.Axundzadə. *Seyyid, ol mah sənin qətlinə iqdam etdi; Gedib öz çarəni qıl, eylədim elam sənə.* S.Ə.Şirvani. [Bəhram:] *Bəhram, qorx! Qorx öz vicdanından! Sən ki Saranın xatiri üçün bu işə iqdam etmişdin, nə tez sovuşdun?* C.Cabbarlı.

**İQDAMAT** [*ər.* "iqdam" söz. cəmi] *kit.* bax **iqdam**. *Belə bir iqdamatın iki qisim gözəl nəticəsi ola bilər.* C.Məmmədquluzadə. *Siz gərək iqdamata başlamaqdan əvvəl mənimlə danışaydınız.* M.S.Ordubadi.

**İQLİM** *is.* [*ər.*] 1. Bir ölkənin, bir yerin meteoroloji şəraitinin (havası, suyu və s.) xüsusiyyətləri, ab-havası. *Kontinental iqlim. Mötədil iqlim. Azərbaycanın aran yerlərinin iqlimi. Soyuq iqlim.* – *Göyərti şərait yaradıldığı təqdirdə, təzə düşdüyü hər iqlimə uya bilər.* Ə.Əbülhəsən. *Hər yer bağbağat olacaq, ölkəmizin iqlimi dəyişiləcəkdir.* Ə.Sadıq. *Görürəm Mingəçevir yanır bir çıraq kimi; Gülür Milin, Muğanın təbiəti, iqlimi.* Ə.Cəmil.

2. *klas.* Ölkə, məmləkət. *Qəmindir könlümün təxtində sultan; Bir iqlimə iki sultan gərəkməz.* Nəsimi. *Ya bu iqlimdən başın al, get; Yoxsa başın götür, hüzuruma yet!* Füzuli. *İqlim-iqlim gəzməyi var; Hər havaya dözməyi var; İnsanın da, ürəyin də.* S.Vurğun.

**İQLİMLƏŞDİRİLMƏ** "İqlimləşdirilmək"dən *f.is.*

**İQLİMLƏŞDİRİLMƏK** *məch.* Yeni iqlim şəraitinə, yeni mühitə alışdırılmaq.

**İQLİMLƏŞDİRMƏ** "İqlimləşdirmək"dən *f.is. Toxumdan alınan bitkilər gec meyvəyə düşür və müxtəlif keyfiyyətli olur. Sitrusların bu qayda ilə çoxalmasından iqlimləşdirmə* (*akklimatizasiya*) *və yeni sortlar əldə etmək məqsədi ilə istifadə edilir.* İ.Axundzadə.

**İQLİMLƏŞDİRMƏK** *f.* Yeni iqlimə uyğunlaşdırmaq, yeni mühitə alışdırmaq (heyvanları, bitkiləri).

**İQLİMLƏŞMƏ** "İqlimləşmək"dən *f.is.*

**İQLİMLƏŞMƏK** *f.* Yeni iqlim şəraitinə, yeni mühitə uyğunlaşmaq, alışmaq.

**İQNA** [*ər.*]: **iqna etmək** *klas.* – qane etmək, qənaətləndirmək, qənaətbəxş olmaq; razı etmək. [Qız:] [Nizamüddövlənin adamları] *hər gün gəlib, məni iqna etmək istəyir, qandırırdılar.* S.Hüseyn.

**İQRAR** *is.* [*ər.*] 1. Dil ilə söyləmə, ifadə etmə, dili ilə təsdiq etmə, etiraf. // Öz sözündə, əhdində möhkəmlik, dayanıq, səbat, sədaqət, vəfa. *Əhdi dürüst ola, iqrarı möhkəm; Fikri-zikri sənin sarı gərəkdir.* Q.Zakir. *Aşinələr ixtilatında sədaqət görmədim; Beyəti-iqrari-imani-dəyanət görmədim?* M.P.Vaqif. ☐ **İqrar vermək** – söz vermək, əhd etmək. *Əvvəl mənə iqrar verib duran yar; Yandırdın dünyada atəşə məni.* Aşıq Əmir. **İqrarından dönmək** – sözündən dönmək, əhdindən qaçmaq, əhdinə vəfa etməmək. *Gətirmədi əhdü iqrarı yerinə; Dilbər iqrarından döndü, neyləyim.* Aşıq Kərim.

2. Təsdiq, etiraf, qəbul. *Bilmirəm siz məndən nə kimi xəyanətlərimin iqrarını tələb edirsiniz.* M.S.Ordubadi. ☐ **İqrar etmək** – boynuna götürmək, qəbul etmək, etiraf etmək, öz dili ilə təsdiq etmək. [Molla

İbrahimxəlil:] *Camaat, bilin və agah olun ki, Mirzə Fətəli öz kafirliyini iqrar etdi.* Ə.Haqverdiyev. *Mən .. iqrar eləyirəm ki, doğrudan da, müsəlmanlar silahlanırlar..* C.Məmmədquluzadə. *Özünün iqrar etdiyinə görə tay-tuşları gecə kurslarında da olsa, oxuyub savadsızlıqlarını ləğv etdilər.* Ə.Vəliyev.

3. Qərar, qənaət, hökm. *Hükəmanın da iqrarı bunadır ki, başın çanağı nazikləşib kiçildikcə, beyin də zəifləşməyə və kiçilməyə başlayır.* C.Məmmədquluzadə.

**İQRARSIZ** *sif.* Dəyanətsiz, öz sözündə, vədində, qərarında sabit olmayan. *Vaqif sevdi bir iqrarsız bivəfa; Badə getdi tamam çəkdiyi cəfa.* M.P.Vaqif.

**İQREK** 1. Latın əlifbasının axırıncıdan əvvəlki hərfi (γ).

2. *riyaz.* X, Z hərfləri ilə yanaşı olaraq, həmin hərflə işarə olunan məchul kəmiyyət.

3. *məc.* Naməlum, yaxud adı çəkilmək istənilməyən şəxsə işarə.

**İQTA** *is.* [*ər.*] *köhn.* 1. Bağışlanmış və ya icraya verilmiş yer.

2. Malikanə.

**İQTİBAS** *is.* [*ər.*] Bir sözü, cümləni və ya fikri eynilə və ya məzmunca başqasının əsərindən alma, götürmə. ☐ **İqtibas etmək** – götürmək, almaq (fikri, sözü və s).

**İQTİDAR** *is.* [*ər.*] 1. Qüvvət, taqət, güc. *Yeriməyə iqtidarı yoxdur. Danışmağa iqtidarı çatmır. – Bura adətən can verən əsirlər, ayağı üstündə durmağa iqtidarı olmayanlar gətirildiyi üçün, bu "ölüm hücrələrinin" keşiyi zəif idi.* Ə.Məmmədxanlı.

2. Qüvvəsi çatma, gücü çatma, imkanı olma. *Zeynal nəinki borclarını verib təmizləmək və ya arvadına və çocuqlarına paltar və ayaqqabı almaq iqtidarında deyildi, hətta gündəlik xərcə də para yetirə bilməyirdi.* S.Hüseyn. *Baş leytenant öz bölüyü ilə hər vaxt hər bir əmrin öhdəsindən gəlmək iqtidarına malikdir.* Ə.Əbülhəsən. // Güc, səlahiyyət, etibar. *Getdi şənimiz, etibarımız; Varmı rütbəmiz, iqtidarımız?* M.Ə.Sabir. *İqtidarın, malın, pulun çoxdur; Xalqa ondan vəli kömək yoxdur.* A.Səhhət.

**İQTİDARLI** *sif.* 1. İqtidarı olan, gücü çatan; güclü, qüvvətli.

2. Bacarıqlı, qabiliyyətli, qüvvətli. *İqtidarlı yazıçı. – "Məktubati-Şeyda bəy" sərlövhəsi ilə yazdığı "Müəllimlər iftixarı" və "Gəlinlər həmayili" adlı kitabçalar Qənizadənin iqtidarlı bir ədib olduğunu bildirir.* F.Köçərli.

**İQTİDARSIZ** *sif.* İqtidarı olmayan, gücü çatmayan; qüvvətsiz, gücsüz. // Bacarıqsız.

**İQTİDARSIZLIQ** *is.* Qüvvətsizlik, gücsüzlük. // Bacarıqsızlıq.

**İQTİSAD** *is.* [*ər.*] b a x **iqtisadiyyat** 1-ci mənada. *Uca mədəniyyət yüksək iqtisaddan asılıdır.* M.S.Ordubadi. ☐ **Siyasi iqtisad** – bəşər cəmiyyəti inkişafının müxtəlif pillələrində ictimai istehsalı və onun paylaşdırılması qanunlarını öyrənən elm.

**İQTİSADÇI** *is.* 1. B a x **iqtisadiyyatçı**.

2. *tar. siyasi.* İqtisadçılıq tərəfdarı (b a x **iqtisadçılıq**).

**İQTİSADÇILIQ** *is. tar. siyasi.* XIX əsrin axırlarında – XX əsrin əvvəllərində Rusiya sosial-demokrat hərəkatında opportunist cərəyan (bu cərəyan tərəfdarlarının fikrincə, fəhlə sinfi ancaq öz iqtisadi vəziyyətini yaxşılaşdırmaq uğrunda mübarizə aparmalı, mütləqiyyətlə siyasi mübarizəni isə burjuaziyanın öhdəsinə buraxmalı idi).

**İQTİSADİ** *sif.* İqtisadiyyatla bağlı olan, təsərrüfata aid olan. *Ölkələr arasında iqtisadi əlaqə. İqtisadi məsələ. İqtisadi böhran. İqtisadi qanunlar. İqtisadi həyat. – "Kəşkül" hər məsələdən yazırdı, iqtisadi, ictimai, siyasi, ədəbi mövzuları işıqlandırırdı.* M.İbrahimov. *Xalq təsərrüfatımızın ümumi inkişafında yaylaqlarımızın, mədən-müalicə sularımızın, kurortlarımızın iqtisadi əhəmiyyəti böyükdür.* Ə.Vəliyev. // İqtisadiyyatın öyrənilməsi ilə bağlı olan. *İqtisadi jurnal. İqtisadi coğrafiya. İqtisadi ədəbiyyat. İqtisadi tədqiqat.*

◊ **Yeni iqtisadi siyasət** *iqt.* – Sovet Rusiyasında keçid dövründə proletar diktaturasının həyata keçirdiyi təsərrüfat siyasəti (sosializm qurulması mənafeyinə xidmət edən bu siyasət dövründə hakim mövqelər dövlət əlində olmaqla, kapitalizmə və azad ticarətə yol verilirdi).

**İQTİSADİYYAT** *is.* [*ər.* "iqtisad"dan] 1. Hər hansı bir ictimai quruluşun, cəmiy-

yətin istehsal qüvvələrinin inkişafına uyğun olan istehsal münasibətlərinin məcmusu. *İqtisadiyyatımızın durmadan tərəqqisi mədəniyyətimizin misilsiz yüksəlməsinə səbəb olmuşdur.* İ.Əfəndiyev.

2. Hər hansı bir ölkənin, rayonun və s.-nin təsərrüfatının vəziyyəti. *Respublikamızın iqtisadiyyatı. Şimal rayonlarının iqtisadiyyatı.* // Təsərrüfatın hər hansı bir sahəsinin maliyyə və maddi cəhətdən quruluşu, vəziyyəti. *Nəqliyyat iqtisadiyyatı. Ticarət iqtisadiyyatı.*

3. Xalq təsərrüfatının hər hansı bir sahəsinin maliyyə və maddi tərəfini öyrənən elm. *İqtisadiyyatdan dərslik. İqtisadiyyata dair mühazirə.*

**İQTİSADİYYATÇI** *is.* İqtisadiyyat, iqtisadiyyat elmləri mütəxəssisi.

**İQTİZA** *is.* [*ər.*] *klas.* Lüzum, lazım olma, zəruriyyət, vaciblik. // Ehtiyac, hacət. *Hala məgər iqtizayi-dövran; Oldur ki, ola o gənc pünhan.* Füzuli. ☐ **İqtiza etmək** – 1) tələb etmək, lüzumlu etmək, vacib etmək, ehtiyac doğurmaq. *Aciz, yazıq bəşərlərə rəhm etməyən qəza; Səndən məni ayırmağı da etmiş iqtiza.* A.Səhhət; 2) müsaidə etmək, imkan vermək. *Əgər onların gündüzləri vaxtları iqtiza etmir, bəs axşamlar niyə təşrif gətirmirlər?* C.Məmmədquluzadə. **İqtizasına görə** – b a x **iqtizasınca**.

**İQTİZASINCA** *zərf klas.* Tələbinə görə, bacarığına görə, ehtiyacına görə. *Hər bir şair öz qəlbinin və təbinin iqtizasınca göy üzündə qatar ilə uçan durnalara öz halidilini ərz qılır.* F.Köçərli.

**İL** *is.* 1. Yer kürəsinin Günəş ətrafında bir dəfə dövr etdiyi müddət (yanvarın 1-dən başlayaraq hesablanan 12 aylıq dövr). *Yerin günəş ətrafında tam hərəkəti bir il çəkir. Bir ilin uzunluğu 365 və ya 366 gündür. – İlin hər fəslinin bir hüsnü var, amma qışın ləzzəti bir özgədir.* C.Məmmədquluzadə. // Hər hansı bir gündən başlayaraq hesablanan 12 aylıq bir müddət. *Hadisədən iki il keçmişdir. Bir ildən sonra 10 yaşı tamam olacaq. Dörd il bir şəhərdə yaşamaq. Bir il səfərdə olmaq.* – [Tapdıq:] *On ildi bu fürsəti güdürdüm; Ey şux, gözüm ki səndədir bil.* C.Cabbarlı. *Baratın Bakıya gəldiyi vaxtdan beş il keçirdi.* M.Hüseyn.

2. Cəm şəklində: tərkibdə sıra sayları ilə onillik müddətləri göstərir. *Doxsanıncı illər. Altmışıncı illər ədəbiyyatı.*

3. Cəm şəklində: müəyyən zaman, dövr bildirir; dövr, zəmanə. *Müharibə illəri. Uşaqlıq illəri. Məktəb illəri. – Yenə bahar gələndə; Volqada axırdı buz; Lakin illər ağırdı; Günlər yaman uğursuz.* R.Rza. [Əntiqənin] *atası qarışıqlıq illərində yatalaqdan ölmüşdü.* Mir Cəlal.

4. *astr.* Günəş ətrafında hər hansı planetin dövr müddəti. *Mars ili.*

◊ **İl dolanmaq** – on iki ay bitmək, qurtarmaq, il başa çatmaq. *Qış getdi, qar gəlmədi; Nə də bahar gəlmədi; İl dolandı, ay ötdü; Gözlədim, yar gəlmədi.* (Bayatı). *Ay keçər, il dolanar. Sənin adın məğribdən məşriqətən bütün dünyada məşhur olar.* "Koroğlu". *Günlər keçdi, .. il dolandı..* M.Rahim. **İl gecə** – qurtarmaq bilməyən, uzun ("uzun gecə" mənasında). *Bağrımı çatlatdılar; Sinəmi oxlatdılar; İl gecəni sübhə tək; Bircə məgər yatdılar?!* M.Ə.Sabir. **İl keçdikcə** – zaman ötdükcə, bir neçə il keçdikdən sonra, vaxtilə. *İl keçdikcə unudulacaqdır. İl keçdikcə ağıllanacaqdır.* **İl uzunu** – on iki ay müddətində, bütün ili, bütün il ərzində. [Həsən:] *Gərək il uzunu işimi-gücümü, dükanımı buraxıb divana yol döyəydim.* Ə.Haqverdiyev. *İl uzunu dərdini çəkməkdəyəm; Aylar ilə göz yaşı tökməkdəyəm.* Ə.Nəzmi. **İl vermək** – xalq adətincə, ölən adam üçün ili tamam olduqda ehsan vermək. **İldən-ilə, illərdən-ilə** – hər il, il keçdikcə, ilbəil, durmadan. *Çay dediyi sözlər yerini aldı; İldən-ilə gölün suyu azaldı.* A.Səhhət. *Şəhərdən kəndə gələn çarpayıların, çəngəl-bıçağın, stol-kürsünün sayı ildən-ilə artır.* İ.Əfəndiyev. *Bəhəri çox verir bağ ildən-ilə.* M.Dilbazi. **İl-ildən** – ildən-ilə, ilbəil. *Azaldı il-ildən bağın meyvəsi; Torpağın hünəri, suyun qüvvəsi.* M.Dilbazi. **İllər ayrısı olmaq** – uzun illər bir-birindən ayrı düşmək, ayrı yaşamaq, bir-biri ilə görüşməmək. *Mən aşıq, ellər ayrısı; Şanə tellər ayrısı; Bir gününə dözməzdim; Oldum illər ayrısı.* (Bayatı). *İllər ayrısıyıq, fürsət düşəndə; Çəkilib pünhana üzün bürümə!* Aşıq Ələsgər. **Tədris ili (akademik il)** – bir

yay tətilinin axırından o biri yay tətilinin əvvəlinə qədər olan dərs məşğələləri dövrü. **Uzun illər** – həmişə, daim, illər boyunca. *Sülh carçısıyıq biz uzun illər, bilir aləm; Sülh şairə, sülh fəhləyə, sülh xalqa gərəkdir.* S.Rüstəm.**Yeni il** – 1 Yanvar günü. *Yeni ili təbrik etmək. Yeni il şənliyində iştirak etmək. Yeni iliniz mübarək!*

**İLAC** *klas.* b a x **əlac**. *Çak görüb köksümü, qılma ilacım, təbib; Zaye olar mərhəmin, məndə bitər yarə yox.* Füzuli. *Kimsənədən olmadı dərdinə, Seyyid, ilac; Eyləmə hər nakəsə halını əfsanə ərz.* S.Ə.Şirvani. *Vazeh bu ki xəstədir məzacın; Ya rəb, kim edər sənin ilacın?* M.Ə.Sabir.

**İLACSIZLIQ** b a x **əlacsızlıq**. *Güllər .. acı bir ilacsızlıq içində qalıb, pianinosunun arxasına keçirdi.* İ.Əfəndiyev. [Bülənd] *ilacsızlıqla* (z.) *Çimnaza və Nazlıya baxdı.* Ə.Əbülhəsən.

**İLAHƏ** *is.* [*ər.*] Antik mifologiyada və bəzi dinlərdə; qadın cinsli allah. *Qədim Yunanıstanda şüəra sinfi bir qissə və hekayət yazmaq istədikləri əsnada "Muza" adlı teatr ilahəsinə rücu edib ondan kömək və mədəd dilərdilər.* F.Köçərli. [Qızlar:] *Çıxar Olimpə şadman; Ən işvəkar ilahələr.* H.Cavid. *Biri deyir ki, sənət təbiətin səsidir; Biri deyir ki, sənət eşqin ilahəsidir.* B.Vahabzadə. // Canan, məhbubə, məşuqə, dilbər; eşq pərisi. [İlyas] *bahar möcüzələrinin qolları arasına girərək bələyindən çıxmış şeir ilahəsinin qolları arasında nazlanırdı.* M.S.Ordubadi.

**İLAHÍ** *sif. din.* [*ər.*] 1. Allaha mütəəlliq, Allaha məxsus, Allaha aid, Allah tərəfindən verilmiş; qeyri-bəşəri. *İlahi hikmətlər xəzinəsi.* – [Şeyx Sənan:] *Bu ilahi sükuta qarşı, Xumar; Həp mələklər olur pərəstişkar.* H.Cavid.

2. *is.* Allah. *Bu dağlar ahı neylər; Başım külahı neylər; Sən ordan bax, mən burdan; Görək ilahi neylər.* (Bayatı). *O gözəllik ilahidən verilmiş; Əvvəldəndi gözlərinin qarası.* Aşıq Əmrah. // *məc.* Qeyri-maddi, qeyri-cismani, ruhani, mənəvi. *İlahi məhəbbət. İlahi eşqin tərənnümü. – Budur! "Leyli Məcnun" – böyük sənətdir! Nə qədər ilahi bir məhəbbətdir!* S.Vurğun. // *məc.* Təmiz, pak. *Nə qədər ilahi bir insansınız; Mənə qardaşdan da mehribansınız.* S.Vurğun.

3. *məc.* Xariqüladə, misilsiz, tayı-bərabəri olmayan, məftunedici. *İlahi gözəllik. İlahi səs.* – [Nizami:] *Dostlar, hamınızı inandıra bilərəm ki, Bərdənin bu ilahi gözəlliyi məni heyran etmişdir.* M.Hüseyn. *Bu, əfsanə və nağıllarda söylənən cənnət bağından, ilahi məxluqlardan gələn səs kimi bakir, gözəl və xoş idi.* Mir Cəlal.

**İLÁHİ** *nida.* Ey Allah, ay Allah (Allaha xitab, yalvarış). *İlahi, bülbülə olsun həmişə gül həmdəm; Müdam o xəstə dilin gülşəni, baharı ola.* S.Ə.Şirvani. *Daşqəlbli insanları neylərdin, ilahi?* M.Ə.Sabir. *Qəmin əlində, ilahi, dönüb ürək qanə.* M.Hadi. [Ana:] *İlahi, üç nəfər yetim balamı sənə tapşırıb gedirəm.* C.Cabbarlı.

**İLAHİLƏŞDİRİLMƏ** "İlahiləşdirilmək"dən *f.is.*

**İLAHİLƏŞDİRİLMƏK** *məch.* Xariqüladə, ilahi bir qüvvə edilmək, Allah sifəti verilmək, Allah sayılmaq. // Allah kimi yüksəldilmək, təqdis edilmək, Allah kimi qarşısında səcdə edilmək. *Təbiət güclərinin ilahiləşdirilməsi. – İlahiləşdirilmiş, mələk simalı, əl çatmayacaq dərəcədə uzaq, xəyali gözəlin yerini sadə, təbii, həqiqi gözəllər tutur.* M.İbrahimov.

**İLAHİLƏŞDİRMƏ** "İlahiləşdirmək"dən *f.is.*

**İLAHİLƏŞDİRMƏK** *f.* Allah saymaq, Allah sifəti vermək. // Allah kimi yüksəltmək, qaldırmaq, təqdis etmək, Allah kimi qarşısında səcdə etmək. *Qədim insan odu ilahiləşdirir, ona tapınırdı.*

**İLAHİLİK** *is.* 1. Ülvilik, müqəddəslik, yüksəklik. [Yaşlı kişi:] *Mən bu səslərdə bir ülviyyət, bir ilahilik görürəm.* S.Hüseyn.

2. *məc.* Son dərəcə gözəllik, füsunkarlıq.

**İLAHİYYAT** *is.* [*ər.*] Dini ehkamlardan bəhs edən sxolastik elm; din elmləri.

**İLAHİYYATÇI** *is.* İlahiyyatla məşğul olan adam, ilahiyyat alimi.

**İLAXIR** [*ər.*] (*ixtisarı i.a.*). Sıra ilə adları çəkilən şeylərin axırında yazılır, ya deyilir və onları davam etdirmək mümkün olduğunu bildirir. *Həmin* [kitabdakı] *nümunələrin arasında saat, .. kəllə qənd, ağızlıq, kitab,*

*çeşmək və ilaxır kimi şeylərin də şəkilləri vardır.* F.Köçərli.

**İLAN** *is.* 1. Bədəni uzun və qıvrılan ayaqsız, adətən zəhərli dişləri olan sürünən heyvan. *Zəhərli ilan. Xallı ilan. – İlanın ağına da lənət, qarasına da lənət.* (Məsəl). *..Ağabala dərviş gürzə ilanları bazar dalına töküb oynadırdı.* Ə.Qəmküsar. [Eyvaz kişi] *özünü itirmədi, sağ əli ilə sol qoluna dolanan ilanın boğazından tutub gücü gəldikcə çayın içinə atdı.* Ə.Vəliyev. ☐ **İlan çalmaq** – ilan vurmaq. *Bəziləri də deyirdilər ki, Qara Məliki ilan çalıb öldürüb.* M.S.Ordubadi.

2. *məc.* Məkrli, xain, acıdil, kinli adam haqqında. [Knyaz:] *Sən də dəf ol ki, hövsələm bitdi; İkiniz bir ilansınız, nankor!* H.Cavid. [Sona:] *Məni o qara ilan Kamran aldatdı.* H.Nəzərli. [Vaqif:] *Basma ayağını bizim torpağa; İlandan, əqrəbdən yar ola bilməz.* S.Vurğun.

3. *məc.* İlan kimi qıvrılan, uzanan şey haqqında. *İlan yolu.* – [Ələmdar] *ilan tatarısını göydə tovlayıb, adam olanın boynuna dolayırdı.* S.Rəhimov.

◊ **İlan ağzından qurtarmaq** – çox təhlükəli, ağır, çətin, çıxılmaz vəziyyətdən qurtarmaq. **İlan ağzından qurtulan quş (qurbağa) kimi** – çox təhlükəli, ağır, çıxılmaz vəziyyətdən qurtaran adam haqqında. *Rübabə qapını bərk itələmiş, ilan ağzından qurtulan quş kimi qaçmışdı.* Mir Cəlal. **İlan çalmış kimi, elə bil ilan çaldı** – bax **ilan vurmuş kimi** 2-ci mənada. *..Qara çadralı qız ilan çalmış kimi yerindən sıçradı.* Ə.Məmmədxanlı. **İlan dili çıxartmaq, ilan kimi dil çıxartmaq** – acizanə yalvarmaq, yazıq-yazıq xahiş etmək, yalvarıb-yaxarmaq. [Güləndam:] *Yusif bəy ilan dili çıxardır, elə zarıyır, elə zarıyır, adamın yazığı gəlir.* N.Vəzirov. *Həmzə .. Veysin qabağında gərək ilan kimi dil çıxarda, arvad kimi göz yaşı tökə idi.* Ə.Əbülhəsən. **İlan əlindən qurtarmaq** – birini zülmdən, əziyyətdən, istismardan azad etmək. *Bir kimsə tapılmaz yetə savaba; Qurtara fəqiri ilan əlindən.* Q.Zakir. **İlan gözü kimi** – çox az, çox zəif, hissedilməz. [Veys] *astaca ora yaxınlaşdıqda ilan gözü kimi işıq süzüldüyünü sezib, qulağını qapıya dayayaraq qulaq asdı.* Ə.Əbülhəsən. **İlan mələyən** – çox isti, quraq və susuz. *İlan mələyən çöllər.* **İlan vuran ala çatıdan qorxar** *məsəl* – başına gəldiyi üçün çox ehtiyatlı, tədbirli hərəkət edən adam haqqında. [Hacı Əhməd:] *O səbəbə ki ilan vuran ala çatıdan qorxar.* C.Cabbarlı. **İlan vurmuş kimi** – 1) əziyyətdən, ağrıdan çapalayan, qovrulan adam haqqında. *Ala pişik bığlarını eşərək yerin ortasında yatmışdı, çünki bu gecə Kosanın yuxusu ilan vurmuş kimi kəsilmişdi.* S.Rəhimov; 2) birdən sıçrayaraq, dik atılaraq, hövlnak. *Yasavulbaşı ilan vurmuş kimi yerindən sıçradı.* M.Rzaquluzadə. **İlana ağı vermək** – xəlvəti, əl altından təhrik etmək, gizlindən öyrədib qızışdırmaq. **İlanın quyruğunu basmaq** – birini qəzəbləndirmək, hirsləndirmək. [Hacı Tağı:] *İndi adam vurub öldürmək vaxtı deyil, ilanın quyruğunu niyə basaq?* Ə.Əbülhəsən. **Dili ilanı yuvadan çıxardır** – bax **dil**[1]. **Elə bil ilan qovub** – çox tələsik, təngnəfəs, nəfəsi qaralmış halda. [Əziz] *hər gecə səhər alaqaranlığında elə gəlir ki, elə bil uşağı ilan qovub.* Ə.Məmmədxanlı.

**İLANBALIĞI** *is. zool.* Dəyirmiağızlılar sinfindən ilanabənzər ibtidai onurğalı heyvan.

**İLANBAŞIOTU** *is. bot.* Alp zonasında daşlı yamaclarda bitən boz tükcüklərlə örtülü çoxillik ot bitki. *İlanbaşıotu .. bəzən zibilli yerlərdə bitir. Tərkibində limon iyli ətirli yağ, .. "A" provitamini vardır.* M.Qasımov.

**İLANCIQ**[1] *is.* Kiçik ilan, ilan balası.

**İLANCIQ**[2] *is. dan.* Ayaqda, qolda yara şəklində baş verən sümük vərəminin xalq arasında adı.

**İLAN-ÇAYAN** *top.* İlan, əqrəb kimi sancan heyvanlar. *Səfər kişi bir-bir barmaqlarını qatlayaraq saydı: – İlan-çayandan xəbəriniz varmı?* Mir Cəlal. [Bəkir dedi:] *Yaxşı-yaxşı yat, ilan-çayan başınızdan çıxsın.* İ.Hüseynov.

**İLAN-ÇAYANLI** *sif.* İlan və əqrəb kimi heyvanlar çox olan yer. *Mərkəzdən uzaq, ..kol-koslu, ilan-çayanlı bir düzdə Güllücə kəndi bina olmuşdu.* S.S.Axundov.

**İLAN-QURBAĞA** 1. *top.* Cürbəcür sürünən heyvanlar; həşərat.

2. *sif. dan. məc.* Pis, oxunması mümkün olmayan, cızma-qara, anlaşılmaz. *İçəridən ilan-qurbağa xətti ilə yazılmış qəribə yazılar meydana çıxdı.* S.Rəhman.

**İLANLI** *sif.* İlan çox olan, ilan yaşayan. *İlanlı yer. – İlanlı çöllərdə şəhərlər saldıq; Dəyişdik dünyanın xəritəsini.* S.Vurğun.

**İLANLIQ** *is.* İlan çox olan yer.

**İLANOTU** *is. bot.* Gövdəsi buğum-buğum, quraqlığa davamlı çoxillik ot (yem bitkisi kimi istifadə olunur).

**İLANOYNADAN** *is.* İlanı müxtəlif üsullarla özünə ram edib, onunla tamaşa göstərən adam. *Dolanır bağrını ilanoynadan; Bir də ki dərvişlər əlində kəşkül.* M.Rahim.

**İLANSAYAĞI** bax **ilanvari**. *İlansayağı yol dağların döşündən burularaq, kəmər kimi aşağıya doğru enir..* M.İbrahimov.

**İLANSOĞANI** *is. bot.* Yumurtavari başlıqlı və salxımşəkilli qısa saplaqlı çiçəkləri olan soğanaqlı çoxillik bitki.

**İLANÜZÜMÜ** *is. bot.* Qırmızı meyvəli yabanı kol bitki və onun meyvəsi.

**İLANVARİ** *sif.* İlan kimi, ilana oxşar; qıvrılıb uzanan, əyri-üyrü. *İlanvari boru. İlanvari yol. – Bir neçə gün sonra Telli balkonda durub getdikcə incələşib gözdən itən ilanvari kənd yoluna baxırdı.* S.Hüseyn.

**İLANYEYƏN** *is. zool.* Qartallar fəsiləsindən ilan yeyən quş.

**İLANYOLU** *sif.* Qıvrılıb uzanan, əyri-üyrü, dolanbac. *İlanyolu* (z.) *dağa çıxdıq.*

**İLAŞIRI** *zərf* Hər ildən bir. *İlaşırı istirahət yerini dəyişmək.*

**İLAVƏ** bax **əlavə**.

**İLBƏİL** *zərf* İldən-ilə, il keçdikcə. *Tuf belə dövrana ki, bədtər olur; Seyri-fələk, dövri-zaman ilbəil.* M.Ə.Sabir. *Dəyişir ilbəil mənim zahirim; Məsləkim, əqidəm dəyişmir ancaq.* B.Vahabzadə.

**İLBİZ** *is. zool.* 1. Əksərən balıqqulağına oxşar bərk çanaq içərisində yaşayan yumşaq bədənli molyusk. *Tənək və sədəf ilbizlərinin öyrənilməsindən aydın oldu ki, yumşaq bədənləri çanaq içərisinə alınmış heyvanlara ilbiz deyilir.* "Zoologiya". *Ancaq arabir ilbizlər bir-birinə səs verib fit çalırdı.* C.Cabbarlı.

2. *məc.* Adamsancan, xəlvəti, əlaltından iş görən adam haqqında. *İlbizin biridir.*

**İLBİZLİK** *is.* 1. İlbiz çox olan yer. *Evin dalı ilbizlikdir.*

2. *məc.* Adam sancma, əlaltından, gizlindən iş görmə. *İlbizlik etmək.*

**İLDƏN-İLƏ** *zərf* Hər il keçdikcə, getdikcə. *Vətənimizin qüdrəti ildən-ilə artır.*

**İLDIRIM** *is.* Havada yığılmış atmosfer elektrikinin çox vaxt əyri-üyrü zolaq şəklində ani parıltısı. *İldırım çaxmaq. İldırım vurmaq.* – [Almaz:] *Bax gör, ildırım necə vurur!* C.Cabbarlı. *Eyni anda ildırım. çaxıb sel-su axan çölü gündüz kimi işıqlandırdı.* İ.Əfəndiyev.

◊ **İldırım kimi** – çox tez, çox iti, çox cəld, çox sürətlə. *İldırım kimi qaçmaq. – At qaratikanlığı yarıb, ildırım kimi süzüb, ilxıçının yanında dayandı.* "Koroğlu". *Tamaşa qorxunc bir qəhqəhə çəkərək ildırım kimi çaya tərəf qaçır.* S.S.Axundov. *Hüseyn pilləkənləri ildırım kimi yuxarı qalxdı.* S.Rəhman. **İldırım sürəti ilə** – çox iti, çox sürətlə, çox tez, çox cəld. *İldırım sürəti ilə hərəkət etmək.* – [Çopo:] ..[Quzatayın] *ordunun qüvvəli bir hissəsini götürərək qarşı dağın arxasına çəkilməsi xəbəri ildırım sürəti ilə yayılmağa başladı.* Çəmənzəminli. *Buludlar arxasında daldalanıb .. fürsət gözləyən üç "M-109" birdən ildırım sürəti ilə şığıdı.* Ə.Vəliyev. **İldırım vurmuş kimi** – bax **ildırım kimi.** *İldırım vurmuş kimi yerindən sıçradı, qalxdı.* H.Nəzərli. **Elə bil ildırım (kimi, təki) vurdu** – bərk, şiddətli təsir, sarsıtma mənasında. *Şahsənəm bu sözü Qəribdən eşidən kimi elə bil onu ildırım vurdu.* "Aşıq Qərib". [Gülçöhrə:] [Arşınmalçının] *gözü gözümə sataşanda, elə bil ki, ildırım kimi məni vurur.* Ü.Hacıbəyov. *Bu söz ildırımtək onları vurdu; Bağrını kababdan betər qovurdu.* H.K.Sanılı. **İldırım sipəri** – binanı, qurğunu və s.-ni ildırım zərbəsindən qorumaq üçün yerlə birləşdirilmiş şaquli metallik mil şəklində qoruyucu. **Üstünə ildırım düşsün (çaxsın)** – qarğış, nifrin ifadəsi. [Fatma xanım:] *Ay səni öyrədənin üstünə ildırım düşsün!* N.Vəzirov.

**İLDIRIMLI** *sif.* 1. Çox vaxt ildırım çaxan. *Ətəyində dalğalanan heyvanlar; İldırımlı dağlar, çöllər bizimdir!* A.Şaiq. *Çoban Fər-*

*zəlidən əli üzülən, Dəli dağın ildırımlı gecəsini xatırlayan Alagöz hıçqıra-hıçqıra otağın küncünə çəkildi.* S.Rəhimov.

2. *məc.* Təşbehlərdə: parlayan, işıqsaçan, ehtiraslı, iti mənasında. *Əsir qızın ildırımlı gecələri andıran qara gözlərində ..* [şair] *həyatının yeni bir məna ilə titrədiyini gördü.* Ə.Məmmədxanlı.

**İLDIZ** bax **ulduz**.

**İLDÖNÜMÜ** *is.* Hər hansı bir tarixi və b. hadisədən daha bir il keçdiyini göstərən gün. *Müharibənin ildönümü. Şairin ölümünün ildönümünə həsr olunmuş gecə.*

**İLƏ** (*ixtisarı* **...la, ...lə**) *qoş.* Qoşulduğu sözlə bəzən (samitlə qurtaranda) bitişik, bəzən də (saitlə qurtaranda) ayrı yazılıb aşağıdakı mənalarda işlənir:

a) vasitə mənası bildirir. *Qarovulçu, kvadrat şəkilli bir taxta ilə yeraltı daxmanın qapısını bağlayır.* M.İbrahimov. *Murtuzayev arvadı Yavəri barmağı ilə eyvana çağırıb tapşırıq verdi.* S.Rəhimov; b) birgəlik bildirir. *Atamla anam. Dayısı ilə xalası;* c) işin birlikdə görüldüyünü bildirir. *Qurban ilə Məsmə xala bir qədər söhbət elədilər.* S.Rəhman. *Eyvazla Gülşən Xanpərinin yanına getdilər.* Ə.Vəliyev; ç) hərəkətin müəyyən məkan boyunca icra olunduğunu, davamını bildirir. *Bağların arası ilə uzanan bir yolla gedirdim.* S.Hüseyn. *Qocaman palıd meşəsinin arası ilə eşilən qarlar havaya dikəlir, ağacların başından yuxarılara sovrulurdu.* S.Rəhimov. *Kim isə .. hasar dibi ilə irəliləyirdi.* Ə.Məmmədxanlı; d) iş və hərəkətin tərzini bildirir. *Dostum Ağabəy əllərini heyrətlə bir-birinə çırpdı.* A.Şaiq. *Gilasın fərəhi artır, gözləri sevinclə parlayırdı.* Mir Cəlal.

**İLƏLƏBƏD** *zərf* [*ər.*] 1. Həmişə, daima, nəhayətsiz, sonsuz olaraq.

2. Heç bir vaxt, bir daha, qətiyyən, əbədən. *İlələbəd sizə ayaq basmaram.*

**İLƏN** "İlə" sözünün qədimi forması. *Aşıq gəlir saz ilən; Ördək ilən qaz ilən; Yar məni yola saldı; Evdən ərkinaz ilən.* (Bayatı). *Çox baxdığına, qəmzə ilən bağrın əzərsən; Hər kimə ki baxmazsan, onunla nəzərin var.* Füzuli. *Mərdlər ilən gəz ki, vəfadar olur; Nakəslərə yoldaş olan xar olur.* M.V.Vidadi.

**İLƏRİ** bax **irəli**. [Balaqardaş:] *Kababdan iləri bir az çörək-pendir .. gətir, qoçaq!* N.Vəzirov. *Mən də evdən apardığım saxsı çanağı iləri sürdüm.* M.S.Ordubadi. *Bu dəfə köksünü vermiş iləri.* S.Vurğun.

**İLGƏK** *is.* 1. Paltarın yaxasında, qolunda, cibinin ağzında və b. yerində düyməni və ya qarmağı keçirmək üçün sapdan, qaytandan düzəldilən balaca yarıq və ya halqa; düymə yeri. *Fabrikdə işləyən qızlar hər düyməni, hər ilgəyi diqqətlə tikir, paltarın möhkəm olmasına çalışırlar.* "Az. qad.".

2. Rəsmi paltarın yaxasında rəngli sırma. [Zəhranın] *əynində boz şineli, şinelin yaxasında, yaşıl rəngli ilgəklərin üstündə qoşa kubiklər vardı.* Ə.Vəliyev.

3. Bax **ilmə**. 1-ci mənada [Səltənət] *xalçanı açıb diqqətlə hər şəklinə, hər naxışına, hər ilgəyinə bir də baxdı.* Mir Cəlal.

**İLGƏKLƏMƏ** "İlgəkləmək"dən *f.is.*

**İLGƏKLƏMƏK** *f.* İlgək vurmaq, ilgək açmaq.

**İLGƏKLƏNMƏ** "İlgəklənmək"dən *f.is.*

**İLGƏKLƏNMƏK** *f.* İlgək tikilmək, ilgək vurulmaq, ilgək açılmaq. *Köynəyin yaxası ilgəklənib.*

**İLGƏKLİ** *sif.* 1. İlgəyi olan. *İlgəkli yaxa.*

2. Halqa şəklində düyünlənmiş. *İlgəkli ip. – Kapitanın yanındakı qarabuğdayı uşaq qayığın baş tərəfindəki ucu ilgəkli uzun və yoğun kəndiri kəmənd kimi atdı və dairəyə keçirdi.* M.Hüseyn.

**İLGƏKŞƏKİLLİ** *sif.* İlgəyə oxşar, ilgək kimi.

**İLGƏKVARİ** bax **ilgəkşəkilli**.

**İLĞAR** *is. qəd.* Ansızın hücum, basqın, düşmən torpağına süvari hücumu. □ **İlğar etmək** – ansızın hücum etmək, basqın etmək. *..Cərrah ibni-Əbdüllah iyirmi beş min nəfər ləşkər ilə üzərinizə ilğar edirlər, qafil olmayasınız.* "Dərbəndnamə".

**İLĞIM** *is. məh.* Quru (susuz) çöllərdə buxarın yerə yayılıb uzaqdan su kimi görünməsi hadisəsi; sərab. *Bizim Əmirxan da ilğımlar kimi; Gah gözə görünür, gah qaçır gözdən.* S.Vurğun. *Mən ilğımın nə olduğunu coğrafiya dərsində oxumuşdum..* İ.Əfəndiyev. *Dərənin hündürlərində, yanıb bozarmış güneylərdə duman kimi qatı ilğım qaynayırdı.* İ.Hüseynov.

**İLHAQ** *is.* [*ər.*] Bitişdirmə, birləşdirilmə, qatma, qatılma; əlavə etmə, əlavə edilmə; qoşma, qoşulma. ☐ **İlhaq etmək** – birləşdirmək, bitişdirmək, qatmaq. **İlhaq edilmək (olunmaq)** – birləşdirilmək, qatılmaq. *Xəlifə Qızıl Arslanın məhv edilməsi nəticəsində Aran və Şimali Azərbaycanın Şirvana ilhaq olunması ilə də razılaşır.* M.S.Ordubadi.

**İLHAQÇI** *is.* Zorla bitişdirən, qəsbkar, qəsbkarlıq siyasəti yeridən.

**İLHAM** *is.* [*ər.*] 1. Yaradıcılıq zamanı özünü göstərən ruhlanma halı, yaradıcı fikrin yüksəlişi; ruhlanma, təb. *Baxdıqca nur əmən bu yeni elə; Sənətin ilhamı açar qolqanad.* A.Şaiq. *Mən ilhamı bir dost kimi; İmdadıma çağırmışam.* R.Rza. *Sənətimə can-qan gətirən, ilhamıma uçuş verən balamla fəxr elədim.* B.Bayramov. ☐ **İlham almaq** – bir şeydən ruhlanmaq, vəcdə gəlmək, yaratmaq üçün ondan qüvvə almaq, təbə gəlmək. *Yenə yaşıl don geyinmiş çəmənlər gülür; Təbiətdən ilham alıb ötür qumrular.* S.Vurğun. *Barmağın gəzdikcə pərdələrdə, mən; Min ilham almışam o nəğmələrdən.* Z.Xəlil. **İlham vermək** – ruhlandırmaq, yaratmaq üçün qüvvə vermək, vəcdə gətirmək, şövqləndirmək. *Ey müqəddəs həyat! Müqəddəs insan! Sana ilham verən yalnız ürəkdir.* S.Vurğun. *Bu, Bayram kişinin şair təbinə yeni bir ilham verdi.* M.Rzaquluzadə. **İlhama gəlmək** – b a x **ilham almaq.** *Şair öz şerinə ilhama gəlib can versə; Şeri bir inci kimi aləmi, dünyanı gəzər.* S.Rüstəm. *Əli içdikcə ilhama gəlib danışan adamlardan idi.* M.İbrahimov. *O, yenə düşünüb ilhama gəldi; Elə bil meşələr salama gəldi.* H.Arif.

2. **İlhamla** şəklində *zərf* – böyük həvəslə, ruh yüksəkliyi ilə, ehtirasla, coşqun. *İlhamla danışmaq. – Bizim ədəbiyyatımızda humanizm coşqun ilhamla tərənnüm edilmişdir.*

**İLHAMÇI** *is.* İlham verən, ruhlandıran, şövqləndirən, ruh və yaradıcılıq qüvvəsi verən şəxs. *Odur ilhamçısı şerin, sənətin..* S.Vurğun.

**İLHAMLANDIRMA** "İlhamlandırmaq"dan *f.is.*

**İLHAMLANDIRMAQ** *f.* İlham vermək, ilham oyatmaq, şövqləndirmək, ruhlandırmaq.

**İLHAMLANMA** "İlhamlanmaq"dan *f.is.*

**İLHAMLANMAQ** *f.* İlhama gəlmək, vəcdə gəlmək, ruhlanmaq. *Gözəl mənzərə şairi ilhamlandırır.*

**İLHAMLI** *sif.* Coşqun, ehtiraslı, ilhamla dolu. *İlhamlı şair. – S.Vurğunun dərin ilhamlı lirikası, xalq ruhunun əzəmətini ifadə edən tarixi dramları, .. epik poemaları mədəniyyətimizin qızıl fonduna daxil olmuşdur.* M.Hüseyn.

**İLHAMVERİCİ** *sif.* İlham verən, ruhlandıran, şövqləndirən. *İlhamverici surət. İlhamverici gözəllik.*

**İLXI** *is.* At sürüsü. *Alı kişi neçə illər idi ki, Həsən xana ilxı otarırdı.* "Koroğlu". *Nəbi .. yal-yamacı bürüyən sürülərə, naxırlara, ilxılara .. tamaşa edirdi.* S.Rəhimov.

**İLXIBAŞI** b a x **ilxıçı.**

**İLXIBAŞILIQ** b a x **ilxıçılıq.**

**İLXIÇI** *is.* İlxı çobanı.

**İLXIÇILIQ** *is.* İlxıçının işi, peşəsi. *Alı kişi nə qədər ilxıçılıq eləmişdi, belə şey görməmişdi.* "Koroğlu".

**İLIQ** *sif.* 1. Azacıq isti, nə soyuq, nə isti, hərarətcə mülayim. *Ilıq su. – Bayırda ilıq bir bahar havası tənəffüs edilirdi.* S.Hüseyn. *Ilıq günəş lopa-lopa buludların arasından üzünü göstərib, havanı qızdırmağa, yeri qurutmağa başlamışdı.* Ə.Əbülhəsən. *Günəşin ilk ilıq şüaları sularda oynaşırdı.* S.Vəliyev.

2. Tamam bişməmiş, bərk bişməmiş, yarımmaye halında bişmiş. *Ilıq yumurta.*

3. *məc. şair.* Hərarətli, oxşayıcı, nəvazişli, mehriban, xoş. *Bu kəlmələrdə xalqın ilıq nəfəsi vardır; Qalib yeni dünyanın ölməyən səsi vardır.* R.Rza. *Bu zərbələrdən duyduğu ağrılar da ..* [Buğaca] *anasının ilıq ipək busələri kimi dadlı gələrdi.* M.Rzaquluzadə. [Bəyim xalanın] *ilıq təbəssümündə, yorğun baxışlarında bir məzəmmət duyurdum.* İ.Hüseynov.

**İLIQLANMA** "İlıqlanmaq"dan *f.is.*

**İLIQLANMAQ** b a x **ılıqlaşmaq**.

**İLIQLAŞMA** "İlıqlaşmaq"dan *f.is.*

**İLIQLAŞMAQ** *f.* Azca qızmaq, ilıq olmaq, istilənmək, soyuqluğu getmək. *Dənizin suyu ılıqlaşıbdır. – Hava necə isti idisə də, su tamam ılıqlaşmışdı.* M.Hüseyn.

**İLIQLATMA** "İlıqlatmaq"dan *f.is.*

**İLIQLATMAQ** *f.* Azca qızdırmaq, istilətmək, ılıq hala gətirmək.

**İLIQLIQ** *is.* Ilıq şeyin halı; hərarətcə mülayimlik, azca istilik. *Yağış mövsümü hələ başlamamışdı. İstilər çəkilmişdi, lakin havada xoş bir ılıqlıq var idi.* Çəmənzəminli.

**İLIQTƏHƏR** *sif.* Azacıq isti, ılıq halda olan.

**İLINMA** "İlınmaq"dan *f.is.*

**İLINMAQ** *f. dan.* 1. Ilıqlaşmaq, azacıq qızmaq.

2. İlıq bişmək (yumurta).

**İLITMA** "İlıtmaq"dan *f.is.*

**İLITMAQ** *f. dan.* Azacıq qızdırmaq, ılıq eləmək. *Maya suyu ılıtdı, dolçanı doldurdu.* S.Rəhimov.

**İLİK** *is.* 1. İnsanın, həmçinin onurğalı heyvanların sümüyü içərisində olan yağaoxşar yumşaq maddə. [Rizvanın] *iliklərində buz kimi bir uçunma gəzməyə başladı.* S.Rəhimov.

2. *məc.* Təşbehlərdə: ağ, zərif, lətif. *..Leylək də arıq dəvə kimi diz çökdü, üzüyü Zərintac xanımın ağ ilik barmaqlarının birinə keçirdi.* S.Rəhimov. *Nazik əllərində ilik kimi ağ barmaqları görünürdü.* Ə.Vəliyev.

◊ **İliyinə işləmək, iliyinə-damarına (qədər) işləmək (keçmək)** – çox dərin təsir etmək, nüfuz etmək. *Soyuq hava adamın iliyinə işləyirdi.* M.Hüseyn. *Şaxta* [qadının] *iliklərinə işləyir.* Ə.Məmmədxanlı. *Gah narın, iliklərə işləyən bir çiskin saatlarla davam edir.* M.Rzaquluzadə. **İliyinə-sümüyünə qədər işləmək (keçmək)** – b a x **iliyinə işləmək, iliyinə-damarına (qədər) işləmək (keçmək)**.

**İLİKLİ** *sif.* İçində ilik olan. *İlikli sümük.*

**İLİKSİZ** *sif.* İçində ilik olmayan. *İliksiz sümük.*

**İLİM-İLİM**: **ilim-ilim itmək, ilim-ilim getmək** – tamamilə yox olmaq, yoxa çıxmaq, izsiz itmək. *Göy üzü kilim-kilim; Yar itdi ilim-ilim; Kəsin düşmən dilini; Doğrayın dilim-dilim.* (Bayatı). *Laçın seydgaha qılanda güzar; İlim-ilim itər bayquş, yapalaq.* Q.Zakir. *Alagözlü gəlin Göygölü düşünürəm; Bu yerlərdən ilim-ilim itib qaçan; Azarı, ölümü düşünürəm.* N.Rəfibəyli. **İlim-ilim itirmək** – 1) səsi bir daha gəlməyəcək yerlərə, uzaqlara göndərmək, uzaqlaşdırmaq; sürgünə, həbsə göndərmək. *O atın ölümünü məndən gördün, məni ilim-ilim itirdin.* Mir Cəlal; 2) yox etmək, yoxa çıxarmaq, öldürtmək.

**İLİNMƏ** "İlinmək"dən *f.is.*

**İLİNMƏK** *f. məh.* Azca qızmaq, ılıq olmaq. *Yazda çayın suyu ilinir.*

**İLİŞDİRİLMƏ** "İlişdirilmək"dən *f.is.*

**İLİŞDİRİLMƏK** *məch.* 1. İlişik hala salınmaq, taxılmaq, keçirilmək, bənd edilmək.

2. *məc.* Bərk vurulmaq, çəkilmək.

**İLİŞDİRMƏ** "İlişdirmək"dən *f.is.*

**İLİŞDİRMƏK** *f.* 1. Bir şeyi başqa bir şeyə keçirib bənd etmək, taxmaq; bir şeyi çəngəl, mıx, düymə və s. bu kimi şeylərlə tutdurmaq. *Hacı Aslan çuxasının ətəklərini qurşağına ilişdirib, qoçu dəstəsinin qabağında o tərəf-bu tərəfə fırlandı.* M.S.Ordubadi. [Məmməd xan:] [Balacayev] *əyninə ağ xalat geymiş, .. gözlərinə ağ dəmir saplı eynək ilişdirmişdi.* S.Rəhimov. *Yusif, fənəri al, bu biri mıxa ilişdir.* P.Makulu. // Bağlamaq, bənd etmək. *Atı bir yerə ilişdir. İpin ucunu ağaca ilişdirmək.* // Dolaşdırmaq, dolaşıq salmaq.

2. Güllələri, patronları dalbadal lüləyə verməmək. *Yaxşı tüfəngdir, hayıf ki, hərdən ilişdirir.*

3. *məc.* Bərk vurmaq, çəkmək (sillə, yumruq, təpik və s.). *Gözünə döndüyüm, faytonu tərpədib bunun böyründən nə tövr ilişdirdisə, təpəsi üstə getdi lığın içinə, ürəyi getdi.* Ə.Haqverdiyev. *Telli bütün acığını* [pişikdən] *çıxarmaq istəyirdi. Ayağı ilə ona bir təpik ilişdirdi.* S.Hüseyn. *Qadın ..* [qarovulçuya] *bir neçə sərt söz söylədi və nəhayət, bir yumruq ilişdirdi.* Çəmənzəminli.

4. *dan.* (Birisinin) işini qarışdırmaq, pis bir əngələ salmaq, dolaşığa salmaq, dolaşdırmaq. *Onu yamanca ilişdirdilər.*

**İLİŞİK** 1. *sif.* Düyün, pırtlaşıq, ilişmiş şeyin halı. *İlişik ip. İlişik məftil.* // İs. mənasında. *Bayaqdan yazıq qadın neçə dəfə məftili ilişikdən qurtarıb.* Mir Cəlal.

2. *məc.* Dolaşıq, qarışıq. *İlişik fikirlər.*

3. *is.* Münasibət, əlaqə, asılılıq. *Onunla heç bir ilişiyim yoxdur.*

4. *is.* Əngəl, maneə. *İşimdə heç bir ilişik yoxdur.* ☐ **İlişiyə düşmək** – əngələ düşmək, pis bir işə dolaşmaq.

**İLİŞİKLİ** 1. *sif.* İlişiyi olan (b a x **ilişik** 2-ci mənada). *İşi ilişikli* (z.) *qoyma.*

2. Əngəlli, dolaşıqlı. *İlişikli iş.*

**İLİŞİKSİZ** *sif.* 1. İlişiyi olmayan.

2. *məc.* Əngəlsiz, maneəsiz, qolay. *Cabbarlının .. qısa yaradıcılıq yolu heç də hamar və ilişiksiz olmamışdır.* M.Arif.

**İLİŞKƏN** *sif.* İlişən, dolaşan; əl-ayağa, paltara yapışan, sancılan. *İlişkən cücü. İlişkən ot. – Balaca Sabir sərt və ilişkən bir şeyin döşündə gəzdiyini görüb gözlərini açdı.* S.Rəhimov.

**İLİŞKƏNLİK** *is.* İlişkən şeyin hal və xassəsi, ilişmə, yapışma xasiyyəti.

**İLİŞMƏ** 1. "İlişmək"dən *f.is.*

2. *məc.* Maneə, əngəl, ilişik. *Səkkiz nəfərlik təmir mexaniki briqadam var, harada bir ilişmə oldu, göndərirəm.* Mir Cəlal.

**İLİŞMƏK** *f.* 1. Taxılmaq, taxılıb qalmaq, bir şeyə keçib qalmaq. [İlyasın] *saçlarına quru ot və saman çör-çöpləri ilişmişdi.* Ə.Məmmədxanlı. // Qarmaq, mıx kimi iti bir şeyə keçmək. *Paltarım mıxa ilişdi. – Çəpərdən hoppananda dəsmal tikana ilişdi.* Mir Cəlal. *Tez geri hərləndim, amma quş doğrudan da kola ilişmişdi.* M.Rzaquluzadə.

2. Bir şeyə toxunmaq, dəymək, ayağı dolaşmaq. *Ayağı daşa ilişmək. Qapıya ilişmək. – Nabələd əcnəbi hündür səkilər üstündən bir neçə qədəm yüyürdüyündən ayaqları pilləkənlərə ilişdi.* S.M.Qənizadə. *Qaraca qızın sağ ayağı kola ilişib qanadı.* S.S.Axundov. *Nadir kola ilişib yıxıldı.* İ.Əfəndiyev.

3. Dolaşıq düşmək, dolaşmaq, qarışmaq, bir-birinə keçmək, ilişmiş kimi ayrılmamaq. *Həmişə radio xətti ilişir telefon xəttinə, dəstəyi qulağına götürəndə, ya son xəbərlər eşidirsən, ya da ki muğamat.* "Kirpi". ☐ **İlişib qalmaq** – bir yerə, bir şeyə dirənərək və ya toxunaraq, maneəyə rast gələrək durmaq, hərəkət etməmək. *Su ilə üzən ağaclar daşlara ilişdi.*

4. Bir yerdə bənd olub qalmaq, ləngimək, ilişib qalmaq. [Mirzədadaş:] *..Sən get evə dəy, mən də gedim görüm, arvad süfrəni açıbdırmı? Bax, artıq ilişmə ha...* N.Vəzirov. ☐ **İlişib qalmaq** – 1) getdiyi və ya keçdiyi bir yerdə müvəqqəti olaraq qalmalı və ya yaşamalı olmaq. [Mirzə:] *..Elə olsun ki, gəlsin, görsün ki, şirni də içilib, tamam olub, ondan sonra ilişib burada qalasıdır.* Ə.Haqverdiyev. *İndiyə qədər də ..*[Meşinovun] *xırda-para işlərdə ilişib qalmağı yalnız müvəqqəti bir haldır.* S.Rəhimov; 2) *məc.* maneəyə rast gələrək çıxa bilməmək, qalmaq. *Qulu öskürdü. Sanki boğazında sümük ilişib qaldı.* M.İbrahimov. *Qarının dodaqları titrədi. O, nə isə xəbər almaq istədi, amma sözləri boğazında ilişib qaldı.* M.Hüseyn. *Rəşid isə dodaqlarında ilişib qalmış çaşqın bir təbəssümlə gah Nərgizə, gah Nərminə xanıma baxaraq nə edəcəyini bilmirdi.* Ə.Məmmədxanlı.

5. *məc.* Sataşmaq, öcəşmək. *Uşağa ilişmək. Hər şey üçün adama ilişmə!*

6. *məc.* Bənd olmaq, gözü tutmaq, istəmək. *Bir gözələ ilişmək.*

7. *məc. dan.* Acgözlüklə yeməyə başlamaq. *Qız, uşaqları ovudub getdi, ortalığa çörək qoydu. Şahzadə Mütalib də bir tərəfdən ilişdi çörəyə.* (Nağıl). *Molla baqqaldan bu sözü eşitcək ilişir kişmiş-noxuda.* "M.N.lətif."

**İLİTMƏ** "İlitmək"dən *f.is.*

**İLİTMƏK** *f. məh.* Qızdırmaq (suyu, xörəyi, çayı və s.-ni). *Kərim də bu uşağa yenə ata kimi öz qüvvətli qollarını açdı, onu öz komalarına gətirdi, əvvəlki kimi ocaq işıldatdı, su ilitdi, onu saxladı.* S.Rəhimov.

**İLK** *sif.* 1. Birinci, əvvəlinci, ən əvvəl olan, ən qabaq (*son* qarşılığı). *İlk uşaq. İlk təəssürat. İlk əsər. İlk sıra.* – [Səmirə:] *İlk günlərdə öz xəstəliyimdən çox, palatada uzanmış yoldaşlarımın vəziyyəti ilə maraqlanırdım.* M.Hüseyn. *Pambıq yığımının ilk günü tamam bir bayrama çevrilmişdi.* İ.Əfəndiyev. ☐ **İlk bahar** – b a x **bahar**. // Lap birinci, lap əvvəl. *Onun təpəsində ilk gündən mənim; Buludlar içində durur məskənim.* M.Rahim. *Əşrəf Nazlını ilk görən günü sevdi.* S.Rəhman. // Əvvəl, başlanğıc, ibtida. *Dünyada hər könül yüksəliş arar; Varlığın nə ilki, nə axırı var.* S.Vurğun.

2. Başlıca, əsas, ən vacib, ən mühüm. *Elimin olsa da aslan ürəyi; Ehtiyatdır igidin ilk bəzəyi.* A.Şaiq.

3. **İlki** şəklində – ananın ilk uşağı, övladı. *Hər kimin ilki dursa, mülkü də durar.* (Ata. sözü). [Diyar kişi:] *İlkim oğul olsaydı, indi mən də kəndin ən varlı adamı idim.* Ə.Məmmədxanlı. *Bahadır ilkiydi Rüstəm kişinin; Qamətdə, cüssədə sanki özüydü.* B.Vahabzadə.

◊ **İlk baxışda (nəzərdə)** – 1) əvvəlcə. [Muradın] *ilk baxışda gözlərinə inanmağı gəlmədi... "Bəlkə azmışam", – deyə zənn etdi.* S.Hüseyn; 2) baxan kimi, görən kimi. *Öylə bir incə şeirsən ki, sana; Ürəyim ilk baxışda bağlandı.* A.Şaiq. *Ormanlar içində durur Talıstan; Ona ilk baxışda vurulur insan!..* S.Vurğun. **İlk baxışdan** – dərhal, üzünə baxan kimi. *Qarının yanındakı ağbəniz cavanın naxoş olduğu ilk baxışdan məlum idi.* Mir Cəlal. **İlk dəfə** – birinci dəfə, əvvəlinci dəfə. *Əsmər həyatında ilk dəfə olaraq əsəbiləşmişdi.* S.Hüseyn. *Həyata ilk dəfə baxandan bəri; Göz yaşı görməmiş ala gözləri.* S.Vurğun. *Elçinin və xüsusilə, ova ilk dəfə gəlmiş Tofiqin səbri tükənmişdi.* M.Rzaquluzadə. **İlk əldə** – birinci növbədə, hər şeydən qabaq, dərhal. *Mənim ilk eşqimi, ilk əldə haman; Gömdülər, bilmədim amma nərəyə!* Ə.Cavad. **İlk öncə** – ən birinci olaraq, əvvəlcə. *Mən gurultu qoparmağı ilk öncə; Alov gözlü şimşəklərdən öyrəndim.* M.Müşfiq. *İnsanlar dəstə-dəstə köçüb Taxça-Taşa; İlk öncə düşündülər: məktəbsiz şəhər olmaz.* S.Rüstəm. **İlk söz** – giriş, giriş sözü, başlanğıc, müqəddimə.

**İLKCƏ** *sif.* və *zərf* Ən birinci, ən əvvəl: hamıdan qabaq.

**İLKİN** 1. *zərf* İlk olaraq, birinci olaraq, ilk dəfə, birinci dəfə. *Gözümü dünyaya açanda ilkin; Anamı görmüşəm, səni görmüşəm.* S.Rüstəm. *Bulağın suyundan ilkin içmək şərəfini qırx cavana verirlər.* R.Rza. *Elə bil ki, ilkin gördüm; Kainatda günəşi.* N.Rəfibəyli.

2. *sif.* İlk, birinci. *İlkin məlumat. İlkin tanışlıq. – Ana, ana! Bu kəlməcik hər körpənin ən ilkin; Öyrəndiyi bir kəlmədir, əmdiyi süddən şirin.* A.Şaiq. *Etiraf edənin hər sözü min-min; Səhər günəşinin ilkin nurudur.* B.Vahabzadə.

**İLKİNCİ** *sıra s.* Birinci.

**İLKİNDİ** b a x **ikindi**. [Molla İbrahimxəlil:] *Molla Həmid, Nuxadan yola düşən adamlar, Şeyx Salahın yazmağına görə, gərək bu gün ilkindi çağı buraya yetişsinlər.* M.F.Axundzadə. *İlkindi çağıydı. Əşrəf yoldaşları ilə bərabər salonda dərs hazırlarkən mürəbbi qapını açaraq, "Əşrəf!" – deyə bağırdı.* A.Şaiq. *Mən hər ilkindi çağı üfüqlərə baxanda; Canlanırsan gözümdə, bir bənövşə yaxanda.* R.Rza.

**İLQAR** *is.* [*ər.* "iqrar"dan] 1. Söz vermə, əhd, vəd, vəfa. *İlqarından dönən namərddir.* (Ata. sözü). [Koroğlu:] *Üz tutmuşam, bu diyara gəlmişəm; Çənlibeldən bir ilqara gəlmişəm.* "Koroğlu". *Biz ki ilqar keçirmişik aradan; Amin desək, tez düzəldər Yaradan.* Aşıq Ələsgər. *Gün çıxar, əriyər dağların qarı; Pozulmaz dostların əhdi, ilqarı..* N.Rəfibəyli. ☐ **İlqar almaq** – söz almaq, vəd olmaq, əhd bağlamaq. *Dəfələrlə bulaq başında onunla görüşmüş, sevişmiş və ondan, öz istilahlarınca, ilqar almışdı.* A.Şaiq. **İlqar vermək** – söz vermək, vəd etmək, əhd etmək. *Yüz il keçsə öz yarımdan dönmərəm; İlqar verdim, ilqarımı danmaram.* Qurbani. **İlqarına düz çıxmaq** – verdiyi sözün, əhdin üstündə durmaq, sözünə sadiq olmaq, vəfalı çıxmaq. *Seyran ilqarına düz çıxıb, yoldaşını satmadı.* M.Hüseyn. **İlqarından dönmək** – verdiyi sözə əməl etməmək, əhdini pozmaq, vəfasız çıxmaq. *Abas ağlar zarı-zarı; Getməz könlümün qubarı; İlqarından dönən yarı; Tanrı tezbazar eyləsin!* Aşıq Abas.

2. *məh.* Hörmət mənasında. *Uşağa buyuranın ilqarı olmaz.*

**İLQARLI** *sif.* İlqarında möhkəm, sözünün üstündə duran, əhdinə əməl edən; vəfalı. *Gedirdim yaraq ilə; Ot biçdim oraq ilə; Bir ilqarlı gözəli; Gəzirəm çıraq ilə.* (Bayatı).

**İLQARSIZ** *sif.* Əhdini pozan, sözündə durmayan, vəfasız. *Su gələr, asta gedər; Astabaasta gedər; İlqarsız qız yanına; Sağ olan xəstə gedər.* (Bayatı). *Sən yaxşıya can de, xaini dağla; İlqarsız adamın nitqini bağla.* Aşıq Şəmşir.

**İLLA** *əd.* [*ər.*] *klas.* 1. İstisna bildirir: ...dən başqa, ...dən savayı. *Cismində yox özgə dərdə tabı; İlla qəmi-eşq iztirabi.* Füzuli.

*Əvət, hər şey para ilə əldə edilir; İlla fəzilət və insaniyyət!* H.Cavid. ◻ **Və illa** *klas.* – bundan başqa. *Və illa min-min illər keçər ki, bu murad hasil olmaz.* M.F.Axundzadə. *Və illa hər bir mövcudatın bir müəyyən təklifi vardır..* C.Məmmədquluzadə.

2. Yoxsa, əks halda. [Durnalar] *ahəstə keçib getsinlər və illa, şahin və laçın duyuq düşüb, onların sürbəsini dağıdar və qızıl qana boyar.* F.Köçərli.

3. Bəzən "da" ədatı və "ki" bağlayıcısı ilə – xüsusən, ələlxüsus.

**İLLAH, İLLAH DA** [*ər.* "illa"dan] *dan.* b a x **illa** 3-cü mənada. [Gülsənəm:] *Yaxşı dedin qoydun? Bizim tövlələrdə yanan* [elektrik] *adamın gözlərini qamaşdırır. İllah da ki mənim kimisinin.* M.Hüseyn. *İllah da ona görə ağır oldu ki, Əntərzadə özünü mərkəz adamı sayırdı.* Mir Cəlal. ◻ **İllah etmək (eləmək)** *dan.* – and vermək, yalvarmaq, təkid etmək, çox çalışmaq. *Ha illah elədik, Kəmalədən söz çıxara bilmədik.* M.Hüseyn. [Əhməd:] *Hacı, inadı var, xahiş eləyərsən oxumaz, nə illah eləyirsən oxumayanda oxumaz! İnaddı!* Mir Cəlal. **Hərçi illah elədi(lər)** *dan.* – nə qədər çalışdı(larsa), səy etdi(lərsə), əlləşdi(lərsə). *Vəzir, vəkil yığılıb münəccim çağırdılar, hərçi illah elədilər, yuxunu yozub bir yana çıxarda bilmədilər.* (Nağıl).

**İLLƏRLƏ, İLLƏRCƏ** *zərf* Bir çox illər boyu, bir neçə il, illər uzunu, illər ərzində. *İllərlə bir iş üzərində işləmək. İllərlə yol gözləmək. İllərlə təcrübə əldə etmək. – Hər kimin ağı qara isə utansın, a balam! Bəlkə illərcə yatanlar bir oyansın, a balam!* M.Ə.Sabir. *Bəlkə illərcə dayansan nazına; Sadə bir kərrə gülümsər o sana.* H.Cavid. *İllərcə dayandın arxan divarda; Hər gələn yolçuya dəhşətlə baxdın.* M.Müşfiq.

**İLLƏT** *is.* [*ər.*] 1. Xəstəlik, azar. *Mən zaminəm ki, olmaya bir illət ilə fövt; Hər xəstəyə dava edələr gər şərab ilə.* S.Ə.Şirvani. *Bu illətin Allaha qalıb bircə davası.* Ə.Nəzmi. [Qurban:] *Məsələ küləkdə deyil, professor, görünür, o qəndil ağaclarının özündə bir illət var.* Ə.Məmmədxanlı. // Cismani nöqsan, qüsur. [Şeyx Mərvan:] *İştə çirkinlik öylə bir illət; Ki, dəmadəm qazandırır nifrət.* H.Cavid.

2. Bir şeyə səbəb olan hal, əsil səbəb. *Ucuzdur, var illəti; Bahadır, var hikməti.* (Ata. sözü). *Millətimizin ehtiyacı, qüsur və nöqsanımızın illəti, dalda qalmağımızın səbəbi nədə isə, gərəkdir dürüst təhqiq və tədqiq oluna.* F.Köçərli. *Lakin ondan da övladı olmadı, buna Xədicə artıq şad idi, çünki illəti ərində görürdü.* S.S.Axundov.

3. Məqsəd, arzu, niyyət. *Aşıq, nədir illətin? Ürəkdə var niyyətin; Məni heyran qoyubdur; Şirin sözün, söhbətin.* (Bayatı). *Dedik, qoy yaşasın, nə minnəti var? Bəlkə çil toyuğun bir illəti var!* S.Vurğun.

**İLLƏTLİ** *sif.* 1. Bir illətə (xəstəliyə, azara) mübtəla olan; xəstə. ..[İflic] *azarına mübtəla olan bir bədənin məriz və illətli hissəsi salamat olan hissəsinə kömək əvəzinə ağırlıq və əziyyət yetirir..* F.Köçərli. // Cismani nöqsanı, qüsuru olan.

2. Bir səbəbi, illəti olan.

**İLLƏTSİZ** *sif.* Səbəbsiz. [Şeyx Sənan:] *Ah, Xumar, Xumar! Niyə gəldin? Deyil bu, illətsiz; Məni məhv eləməkmi niyyətiniz?* H.Cavid.

**İLLİK** *sif.* 1. Bir il davam edən və ya davam etmiş. *İllik ezamiyyət. İllik fəaliyyət. İllik gəlir. İllik orta temperatur.* // Bir il üçün nəzərdə tutulmuş, bir il üçün hesaba alınmış. *İllik hesabat. İllik tapşırıqlar yerinə yetirilmişdir. – Tahir bir neçə gün əvvəl illik planı doldurduqlarını söylədi.* M.Hüseyn. [Usta Qəzənfər:] *Dəniz neftçiləri illik planı vaxtından əvvəl yerinə yetiriblər.* Z.Xəlil. // İldə bir dəfə çıxan, ildə bir dəfə olan. *İllik məcmuə. Akademiyanın illik yığıncağı.*

2. Bir yaşında. *İllik bala. – Siz sərv kimi sərkəş olub böylə boy atdız; İllik beçətək banlayaraq xalqı oyatdız.* M.Ə.Sabir.

**...illik** – ilin sayını bildirən mürəkkəb sözlərin ikinci tərkib hissəsi; məs.: beşillik, üçillik, ikiillik.

**İLLÜMİNÁTOR** *is.* [*lat.*] Hava və su nəqliyyatı vasitələrində şüşəli pəncərə.

**İLLÜSTRÁSİYA** [*lat.*] Kitabın mətni ilə əlaqədar olan və bu mətnin izahına kömək edən şəkil. *Jurnalın beşinci nömrəsində dərc olunmuş "Məclisi-ədəb" şəkli müsəl-*

*manlarda susmanın, mütiliyin və tam sükutun nə qədər uca bir mərtəbədə tutulduğunu göstərən ən yaxşı illüstrasiyadır.* F.Köçərli. *Kitab illüstrasiyası janrı sərgidə olduqca zəif təqdim olunmuşdur.* (Qəzetlərdən).

**İLLÜSTRATİ́V** *sif.* [*lat.*] Əyani. *Lüğətdə illüstrativ material.* // İllüstrasiyaya aid, illüstrasiya məqsədi daşıyan.

**İLLÜSTRÁTOR** [*lat.*] Kitabın mətninə dair şəkillər çəkən rəssam; kitab rəssamı.

**İLLÜZİONÍST** [*fr.* illusion-dan] 1. İllüzionizm (1-ci mənada) tərəfdarı.

2. Müxtəlif və mürəkkəb üsul və vasitələrin köməyi ilə cürbəcür fokuslar göstərən sirk artisti; gözübağlıca.

**İLLÜZİONÍZM** *is.* [*fr.*] 1. Maddi aləmin illüziyadan – yanlış təsəvvürlərdən başqa bir şey olmadığını iddia edən, elmə zidd, idealist fəlsəfi görüş.

2. Sehrbazlıq, gözbağlıcalıq.

**İLLǗZİYA** [*fr.*] Olmayan bir şeyi həqiqi bir şey kimi qəbul etmə; yanlış, səhv təsəvvür; xəyal. [Teatr direktoru:] *Çünki biz səhnədə bəzən boyalar vasitəsilə illüziya yaradırıq, alaqapı isə möhkəm materialdan düzəlir.* M.Hüseyn. // Boş ümid, xam xəyal. *Bunların hamısı illüziyadır.*

**İLMƏ** *is.* 1. Toxunma şeylərin (xalça, corab, parça və s.-nin) ayrı-ayrı halqaşəkilli düyünləri. *İlmə salmaq. İlmə vurmaq. – Ustabaşı kənarda durub .. təlimat verir, qabarlı əllər ilmə düyürdü.* Çəmənzəminli. *Qız keçib dəzgah arxasında oturdu, barmaqları ilk ilmələri vurarkən gözlərində dərhal, bir zaman nanəli dərədə gördüyü çiçəklərin xəyalı hərəkətə gəlib canlandı.* Ə.Məmmədxanlı. *Onun hər ilməsində, hər xalında və hər gülündə Hikmətin ağ və möhkəm barmaqları görünürdü.* Mir Cəlal.

2. Kisə kimi şeyləri açıb-bağlamaq, asmaq üçün qaytan. *Ondan çantanın ilməyini qoluna taxmağı xahiş etdi.* Ə.Əbülhəsən. // b a x **ilgək** 1-ci mənada. *Yaxamın ilməsi yox; Qırılıb düyməsi yox: Məni qoyub gedəli; Üzümün gülməsi yox.* (Bayatı).

**İLMƏK** *is.* 1. Asanlıqla açılan düyün. *Mustafa bəy örtüyü götürdükdə bir dənə ilmək hörülmüş kəndir görür.* Ə.Haqverdiyev. *..Belindən qayışını açıb bir ucunu onun buynuzuna ilmək kimi salıb çəkdi.* M.Rzaquluzadə.

2. B a x **ilmə**. *Səltənət bu şəkillərə vurduğu hər ilmək, hər xal üstündə əsmişdi.* Mir Cəlal.

**İLMƏKLƏMƏ** "İlməkləmək"dən *f.is.*

**İLMƏKLƏMƏK** *f.* 1. İlməyə keçirmək, ilməyə bənd etmək.

2. İlmək vurmaq.

**İLMƏKLƏTMƏ** "İlməklətmək"dən. *f.is.*

**İLMƏKLƏTMƏK** *icb.* İlməklə bağlatmaq, ilməyə bənd etdirmək.

**İLMƏKLİ** *sif.* İlmək vurulmuş, ilməyi olan. *İlməkli ip.*

**İL-MÜDAM** *zərf* Daim, həmişə. *Həsrətindən sızıldaram sübhü şam; Cism xəstə, gözü yaşlı il-müdam.* Aşıq Nəbi. *Arizdən Məcnunə tez yetir pəyam; Nə dolanır səhralarda il-müdam.* Aşiq Ariz.

**İLTİCA** *is.* [*ər.*] 1. Sığınma, birinin yanına qaçıb himayə istəmə, pənah gətirmə. [Fərhad:] *Mən ömrümdə bir kəsə yalvarmadığım halda, namusum yolunda iltica dili açaraq sizə yalvarıram.* C.Cabbarlı. [Sarıköynəyin] *gözlərinin dərinliklərində rica ilə qarışıq bir iltica xahişi var idi.* S.Hüseyn. ☐ **İltica etmək (eyləmək, gətirmək)** – pənah gətirmək, sığınmaq, himayə istəmək. *Dərgahına saqi eylər iltica; Baş əyər sürahi, piyalə sənə.* Q.Zakir. [Xanım:] *Siz bilirsiniz ki, mən onun xanımı deyiləm, zatən aramızda iyirmi yaş fərq var. Ancaq bir parça çörək üçün evinə iltica etmişəm..* Çəmənzəminli.

2. *məc.* Xahiş, rica, yalvarış. *Aşıq-məşuq olub, qəlbi yanmasa; Bir bu qədər ilticayə düşərmi?* Aşıq Ələsgər. *Uzun ilticadan sonra Babaxan qızı inandırmışdı.* Mir Cəlal. ☐ **İltica etmək (eləmək)** – xahiş etmək, rica etmək. *Məşədi Əsgər təcilən..* [müsafirə] *tərəf yan alıb, çamadanını aparmaq üçün öz dili ilə ona iltica etdi.* S.M.Qənizadə. *..Mirzə Fətəli əziz və mehriban dayısının ayağına düşüb, ondan .. iltica eləyir ki, onu qulluğa qoysun.* F.Köçərli.

**İLTİFAT** *is.* [*ər.*] 1. Lütfkarlıq, lütf, mərhəmət, etina. *Vardır şirin-şirin xoş ixtilatın: Nə fayda Vaqifə yox iltifatın.* M.P.Vaqif. *Kəsmə iltifatın qul Ələsgərdən; Kərəmli*

*sultanım, getmə, amandı.* Aşıq Ələsgər. [Eldar:] *Mən ağlımı itirmişəm, mənim iztirablarımı sənin ancaq belə iltifatların azalda bilər.* S.Hüseyn. // Hörmət, ehtiram, hüsn-təvəccöh, gülər üz göstərmə, xoş münasibət. *Qarı Aqilin ürək tərpədən iltifatına qarşı indi heyran-heyran baxır.* S.Rəhimov. *Cəmil utandığından cavab verə bilməyir, yalnız gülümsəyirdi. Sara isə müdirin iltifatından razı idi.* Mir Cəlal. □ **İltifat etmək** (**eləmək, göstərmək** və s.) – 1) mərhəmət etmək, xeyirxahlıq göstərmək, yaxşılıq etmək, mərhəmət edib vermək. *Sən belə hərgah mənə qəmxar isən; Bir qədər ip tap, mənə qıl iltifat.* A.Səhhət; 2) xoş üz göstərmək, hörmət göstərmək, lütf etmək. *Nayib Cəfər bizə iltifat elədi və oturmağa yer göstərdi.* C.Məmmədquluzadə. [Mozalan bəy:] *Hacı mənə həqiqət artıq iltifat eylədi.* Ə.Haqverdiyev. **İltifat buyurmaq** *köhn.* – b a x **iltifat etmək.** [Cəfər:] *Bağışlayın, yoldaşlar. Sizdən bir ricam var. Biletiniz varsa, bir naharlıq iltifat buyurun.* Çəmənzəminli. *Əgər bu növ kəşfiyyatçılardan biri iltifat buyurub türk qadınlığına da balaca bir nəzər salsa idi, .. biz də bu gün seçki zamanında Tükəzban xalanı meydanda tək qoymazdıq.* B.Talıblı.

◊ **İltifatın(ız) artıq olsun!** – təşəkkür bildirir (bəzən kinayə yerində işlənir). [*Vəli:*] *Bəy, iltifatın artıq olsun.* Ü.Hacıbəyov. [Nəriman:] *Çox sağ ol, Qərənfil! İltifatın artıq olsun!* İ.Əfəndiyev. [Sevinc:] *İltifatın artıq olsun, biz sənin çörəyini yemirik.* Z.Xəlil.

**İLTİFATKAR** [*ər.* iltifat və *fars.* ...kar] b a x **iltifatlı.**

**İLTİFATKARANƏ** *zərf* [*ər.* iltifat və *fars.* karanə] *köhn.* İltifatla, hörmətlə, hüsn-təvəccöhlə, gülər üzlə, xoş üzlə. *İltifatkaranə qəbul etmək.*

**İLTİFATKARLIQ** b a x **iltifatlılıq.**

**İLTİFATLI** *sif.* 1. İltifatla olunan (edilən). *İltifatlı münasibət.*

2. İltifat edən, hüsn-təvəccöh göstərən, xoş sifət, lütfkar.

**İLTİFATLILIQ** *is.* İltifatlı olma, iltifat göstərmə, lütfkarlıq.

**İLTİFATSIZ** *sif.* İltifatı olmayan, iltifat göstərməyən (etməyən), üz göstərməmə, xoş üz göstərməmə; hörmətsizlik.

**İLTİFATSIZLIQ** *is.* İltifat göstərməmə, xoş üz göstərməmə; hörmətsizlik, nəzakətsizlik.

**İLTİHAB** *is.* [*ər.*] *tib.* Bədənin bir yerində qızdırma, şiş, qızartı şəklində təzahür edən xəstəlik prosesi. *Ağ ciyər iltihabı. İltihab prosesi. Boğazında iltihab var.*

**İLTİHABLAŞMA** *tib.* 1. “İltihablaşmaq”-dan *f.is.*

2. İltihab əmələ gəlmə, iltihab prosesi. *Mədənin selikli qişası spirtin təsirindən şiddətli qıcıqlandığından iltihablaşma əmələ gəlir ki, bu da qidanın həzmində iştirak edən vəzilərin işini pozur.* “Az. qad.”.

**İLTİHABLAŞMAQ** *f. tib.* İltihab əmələ gəlmək.

**İLTİMAS** *is.* [*ər.*] Xahiş, rica. *Mən yüzbaşının iltimasına görə bu kağızı cırıram.* C.Məmmədquluzadə. *Çoxlar getdi iltimasa, gəlmədin; Vaqif öldü, neçin yasa gəlmədin?* M.P.Vaqif. *Əslində Qədirin nə üçün sarınmağını bilməyən ağsaqqallar iltiması dərhal qəbul etdilər.* Mir Cəlal. □ **İltimas etmək (eləmək)** – xahiş etmək, rica etmək, minnət eləmək. *Koroğlu iltimas eylər; Bala, incitmə Qıratı!* “Koroğlu”. *Obanın ahıl-cahılı Kərəmdən bir az oxumasını iltimas elədilər.* “Əsli və Kərəm”. *İltimas eylərəm, gedən canlara; Dost-düşmən içində yar oynamasın.* Aşıq Ələsgər.

**İLTİMASÇI** *is.* İltimas edən, minnətçi. [Usta Zeynal Qurbana:] *..De ki, ay kafir oğlu kafir, burada nə bir o qədər iş var ki, sən mənim sözümə inanmayıb, Hacı Rəsulu iltimasçı salırsan.* C.Məmmədquluzadə.

**İLTİSAQİ** [*ər.*]: **iltisaqi dillər** *dilç.* – sözün kökünü dəyişdirmədən, ona şəkilçilər artırılmaqla yeni formalar və ya yeni sözlər düzəldilən dilləri; məs.: türk dilləri, fin-uqor dilləri. *Azərbaycan dili iltisaqi dillərdəndir.*

**İLTİSAQİLİK** *is. dilç.* İltisaqi dilin xüsusiyyəti, keyfiyyəti. *Türk dillərinin iltisaqiliyi.*

**İLTİZAM** *is.* [*ər.*] 1. Bir işin yerinə yetirilməsini lazım bilmə, özü üçün borc hesab etmə, boynuna götürmə, öhdəsinə götürmə.

2. *köhn.* Qrammatikada: iş, hal və hərəkətin söz söylənən vaxtdan sonra icrasının lazım olmasını göstərən feil forması; lazım forması.

3. B a x **iltizamnamə**.

**İLTİZAMÇI** *is. köhn.* Bir şeyi öhdəsinə götürərək, yerinə yetirəcəyi haqqında dilindən kağız vermiş adam.

**İLTİZAMNAMƏ** *is.* [*ər.* iltizam və *fars.* namə] Mütləq yerinə yetirməyi tələb edən yazılı vəd, öhdəçilik kağızı. *İltizamnamə vermək* (dilindən kağız vermək). – *Şübhəsiz ki, belə bir iltizamnaməni imza etmək hər kəs üçün çətin idi.* M.S.Ordubadi. [Səlim:] *Sən burada idarənizin müdiri yoldaş Möhsünzadəyə bir iltizamnamə yazıb verərmisən ki, hər ay maaşından bu pulu Mehribana versin?* S.Hüseyn.

**İLYARASI** *is.* Sağalması uzun sürən və sağalandan sonra (adətən üzdə) yeri qalan yara. [Bəyin] *çənəsinin yanları .. yanağında ilyarası, qırışıqlar, çal-çarpaz cizgilər arasında bürüşmüşdü.* Mir Cəlal.

**İMA** *is.* [*ər.*] *klas.* İşarə, kinayə, eyham, him, örtülü məna. *O dalğın gözlərə baxdıqca ruhim eylər istila! O gözlər hər baxışda fikrə yüz min rəmz edər ima!* H.Cavid. [Studentin] *yoldaşları adət üzrə ondan "Ev sahibi xanım gözəldirmi?" – deyə ima ilə soruşduqda, ciddi cavab verdi.* Çəmənzəminli. *Eşqimin bir başqa iması yoxdur; Onun haqqa tapan imanı aydın.* Ə.Cavad.

**İMAJİNİST** *is. ədəb.* İmajinizm tərəfdarı.

**İMAJİNİZM** [*fr.*] XX əsrin əvvəllərində rus poeziyasında ədəbi yaradıcılıqda ideyalılığı rədd edən formalist cərəyanlardan biri.

**İMALƏ[1]** *is.* [*ər.*] 1. Mədəni süni surətdə təmizləmək məqsədi ilə düz bağırsağa maye daxil etmə. *İmalə etmək.*

2. Bu mayeni düz bağırsağa yeridən alət.

**İMALƏ[2]** *is.* [*ər.*] *ədəb. köhn.* Əruz vəznində yazılmış şeirlərdə: qısa oxunması lazım gələn hərəkənin vəznə uyması üçün qeyri-təbii olaraq uzadılmasından ibarət vəzn nöqsanı.

**İMAM** *is.* [*ər.*] 1. Müsəlmanlarda: camaat namazına başçılıq edən, habelə bir məhəllədə nikah, ölüm və s. dini işlərə baxan ruhani. *İmamə ixtiyarın vermə, hərgiz uyma təkbirə: Özün kim faili-muxtarsan, biixtiyar olma.* S.Ə.Şirvani. [Məşədi:] *Bunun evini yıxıb, bu halətə salan imam oldu.* Ə.Haqverdiyev. *Mən sözümü qurtarmamışdım ki, məhəllənin imamı Şeyx Mirhadi içəri girdi.* Qantəmir.

2. Məzhəb və ya təriqət başçısı. // Şiə məzhəbi başçısı sayılan Əli və onun övladlarına verilən ad. *İmam üçün ağlayan gözdən olar.* (Ata. sözü). [Molla Kazım:] *Deyirlər, oruc nahaq, namaz nahaqdır. İmam təziyyəsi nahaqdır.* Ə.Haqverdiyev. [Molla Xəlil:] *Sən imamların bacılarını, qızlarını yadına sal, səbr elə!..* S.Hüseyn.

3. Bəzi kiçik ərəb dövlətlərində dövlət başçısı.

**İMAMCÜMƏ** *is.* [*ər.*] *din.* Cümə günləri camaat namazına başçılıq edən ruhani. [İsmayıl:] *Təbriz böyük şəhərdir, savadlı imamcümələr var.* P.Makulu.

**İMAMƏT** *is.* [*ər.*] *din.* İmamlıq. *Vaxta ki, ona imamət verilib, o hər şeyi bilər.* Ə.Haqverdiyev.

**İMAMLIQ** *is. din.* İmam vəzifəsi, imam rütbəsi. *İmamlıq etmək.*

**İMAMZADƏ** *is.* [*ər.* imam və *fars.* ...zadə] İmamların, övliyaların və onların övladlarının basdırıldığı yer; ziyarətgah. [Gövhərtacın anası:] *Dünən mən gedib imamzadədə şam yandırdım.* Ə.Haqverdiyev. *Bu on beş il ərzində yer qalmadı – pir, imamzadə, ocaq, ziyarət qalmadı ki, Münəvvər xanım baş vurmasın..* Mir Cəlal. [Molla:] *Bu saat camaat özündən çıxmışdır, dəstələr təşkil edərək imamzadəyə gedir.* P.Makulu.

**İMAN** *is.* [*ər.*] 1. İnanma, dərin inam. [Nüşabə:] *Sənə qəlbimdə bir iman vardı; Könlümü şübhə, tərəddüd sardı.* A.Şaiq. [Kərimxan:] *Hələ də öz imanında möhkəm qalmaq istəyirdi.* M.İbrahimov. // İslamiyyətdə: dinə, Allahın birliyinə, peyğəmbərlərə inanma və bunu dillə iqrar etmə; etiqad. *Dil zülfilə rüxsarüvə çün qıldı təmaşa; Avarə qalıb küfr ilə iman arasında.* Heyran xanım. *Bu isə bəs o ləinin də işi qullabıdır; Dini, imanı danıb, yoldan azıbdır, babıdır.* M.Ə.Sabir. [Müridlər:] *Şeyximiz atdı hökmi-Quranı; Şeyximiz satdı dini, imanı.* H.Cavid. ☐ **İman etmək (bəsləmək, gətirmək)** – inanmaq. *Beləliklə,* [İldırımzadə] *Dəmirova .. dərin bir iman bəslərdi.* S.Rəhimov. **İman əhli** – dinə inanan, dini ehkamlara riayət edən, etiqadlı. *Dünya görmüş adam* (*özü də iman əhlinə oxşuyurdu*) *yenə bir dərin ah çəkib dedi..* C.Məmmədquluzadə.

**İmana gəlmək** – 1) islam dinini qəbul etmək, dönüb müsəlman olmaq (qeyri-müsəlman haqqında). *Üzünü görsə əgər gəbrlər imana gələr; Küfrdən əl götürüb rahi-müsəlmanə gələr.* Q.Zakir. *Biçarə Kərimi salma nəzərdən; Əgərçi kafirəm, gəldim imana.* Aşıq Kərim; 2) *məc.* xeyli xahişdən, inandırmadan, təkiddən, səydən sonra razı olmaq, qəbul etmək. *İmana gəlmir ki, gəlmir.* **İmana gətirmək** – 1) təbliğat və s. yolu ilə birinə müsəlmanlığı qəbul etdirmək; 2) *məc.* xeyli xahişdən, inandırmadan, təkiddən, səydən sonra razı olmasına, bir şeyi qəbul etməsinə nail olmaq. **İmandan çıxmaq** – dindən çıxmaq, dini ehkamları pozmaq. **İmanı kamil olmaq** – 1) imanı, etiqadı, əqidəsi təmiz olmaq; 2) *məc.* məqsədinə, məramına çataraq rahat olmaq. *O mehrabü minbər qaşlara mail; Olmayanın olmaz imanı kamil.* Q.Zakir. [Əsgər Süleymana:] *Hərgah bir işi də bilsən, onda imanım kamil olar.* Ü.Hacıbəyov. **İmanını satmaq** – yalandan şahidlik etməklə əqidəsini, məsləyini birinə qurban etmək, satılmaq. *İmanını satıb, əppəyinə qatıq eləyir.* (Ata. sözü). [Rüstəm bəy:] *..Bax imanımı belə satmışam.* S.S.Axundov. **İmanını tərəziyə qoymaq** – alverdə müştərini aldatmaq, çəkidə aldatmaq. *Baqqal qoyar tərəziyə imanın.* Q.Zakir. **İman-güman** – şübhə, zənn, güman. *Əntiqə Hacı Rəsulun nəyinə lazımdır? Burada iman-güman çox yerə gedə bilər.* Mir Cəlal. **Allah imanını kamil eləsin** – birinə xeyir-dua məqamında. [Kərbəlayı Xeyransa:] *A...a...a... balam, Allah imanını kamil eləsin, ay Məşədi Püstə bacı, mənim heç yadımda yoxdu.* H.Sarabski. **Sahibi-iman** – b a x **iman əhli**. *Yox yeni bir dinə yəqinim mənim; Sahibi-imanəm, a şirvanlılar!* M.Ə.Sabir.

2. **İmanla** şəklində *zərf* – etiqadla, inanaraq. *Mən sizə imanla vermişəm könül..* A.Şaiq.

**İMANLI** *sif.* Dinə inanan, dindar. // İnsaflı. *Amma bu qarı çox imanlı qarı idi.* "Əsli və Kərəm".

**İMANSIZ** *sif.* 1. Dinsiz, Allahsız, etiqadsız; kafir. // İs. mənasında. [Bəndalı:] *Görmürsən bu imansızları, bu saqqalı qana bulanmışları!* Mir Cəlal.

2. *məc.* Mərhəmətsiz, insafsız, qəddar. *Dinsizin öhdəsindən imansız gələr.* (Ata. sözü). *Yaman imansız kişidir, maşını saxlatdı, dedi: – Düş yerə..* M.İbrahimov. [Yunis:] *Əgər sən bilsəydin ki, xalacan, o Yaqutun anası necə imansız arvaddır, sənin də qanın qaralardı.* Ə.Məmmədxanlı.

**İMANSIZCASINA** *zərf* İnsafsızlıqla, mərhəmətsizcəsinə, amansızcasına, qəddarcasına.

**İMANSIZLIQ** *is.* 1. Dinsizlik, kafirlik.

2. *məc.* Mərhəmətsizlik, insafsızlıq, qəddarlıq, amansızlıq.

**İMARƏT** *is.* [*ər.*] Böyük və qəşəng bina, ev; mülk, tikili. [Mirzə Kərim:] *Gərək sizin hər birinizin daxmalar əvəzinə gözəl imarətiniz olsun.* Ə.Haqverdiyev. *Ağalıq evi təzə qayda ilə tikilmiş ikimərtəbə gen-bol bir imarət idi.* S.S.Axundov.

**İMDAD** *is.* [*ər.*] Kömək, yardım; darda qalmış bir adamın köməyinə yetişmə, dadına yetmə. *Koroğlunun dəlilərdi imdadı; Qılınc çəkdi, hasil ola muradı.* "Koroğlu". *Görüşdülər, öpüşdülər o qəhrəmanlar; Bir-birinin xilaskarı, imdadı kimi.* S.Vurğun. [Qız] *əlləri ilə oğlanın iri çiyinlərinə elə ilişmişdi ki, deyərdin, bundan nə isə kömək, imdad gözləyir.* Mir Cəlal. □ **İmdad etmək (eləmək, qılmaq)** – kömək etmək, dadına yetmək. *Könül şəhrin çalıb yəğmaladı qəm ləşkəri, Zakir; Neçin imdad qılmaz, bəs deyirdin padişahım var.* Q.Zakir. *Çün natəvanü zarü zəifəm firaqdən; Bu gün də yar etməsə imdad, ağlaram.* X.Natəvan. *Sən könül fürsət tapıb ol yarə qurban, kim sənə; Gər əlimdən gəlsə, billah, mən də imdad eylərəm.* S.Ə.Şirvani. **İmdada qoşmaq** – b a x **imdadına qoşmaq (yetmək)**. [İblis:] *Heyhat, olamaz dərdinə bir kimsədən imdad; İmdadə qoşar, qoşsa fəqət ah ilə fəryad.* H.Cavid. **İmdada yetirmək** – köməyə çatdırmaq, dada yetirmək. *Çünki hicran ələmi saldı məni zindanə; Ey əcəl, rəhm elə, sən özün imdada yetir.* Heyran xanım. **İmdaddan düşmək** – gücdən düşmək, əldən düşmək, qocalmaq. *O, imdaddan düşüb, heç bir şeyə yaramır.* **İmdadı kəsilmək** – hər şeydən ümidi kəsilmək, köməksiz qalmaq. *Oğlu öldü, imdadı kəsildi.* **İmdadına qoş-**

**maq (yetmək, çatmaq, gəlmək)** – bərk ayaqda, çıxılmaz vəziyyətdə qalmış bir adamın dadına çatmaq, köməyinə gəlmək. [Gülsənəm:] *Səndən başqa bizim imdadımıza yetən yoxdur.* S.S.Axundov. [Kimon:] *Çatdı imdadına bu qız, ey xan!* A.Şaiq.

**İMDADSIZ** *sif.* Köməksiz, yardımsız. ☐ **İmdadsız qalmaq** – köməksiz qalmaq, tək qalmaq, əli heç kəsə çatmamaq.

**İMDADSIZLIQ** *is.* Köməksizlik, çarəsizlik.

**İMDİ** bax **indi**. *Bu çərxi-fələk tərsinə dövran edir imdi.* M.Ə.Sabir. [Sabbah:] *Saqın, imdi sizə verməm sevgili Xəyyamı.* H.Cavid.

**İMDİCƏ** bax **indicə**.

**İMƏCİ** *is.* İməcilikdə iştirak edən adam. *Həyətdə iri palazlar döşəmiş, iməcilər çağırmışdı.* A.Şaiq. ☐ **İməci olmaq** – birinə kömək etmək məqsədi ilə görülən faydalı işdə iştirak etmək. [Ballının] *bildirə kimi atası kəndin naxırını otarar, anası qapılarda iməci olub, onun-bunun hanasını toxuyardı.* Ə.Vəliyev.

**İMƏCİLİK** *is.* Könüllü olaraq və zəhmət haqqı almadan ictimai-faydalı bir işi, tapşırığı kollektiv surətdə, elliklə yerinə yetirmə. *Bu iməcilik böyük bir əmək bayramına dönmüşdü. Burada hər millətdən çalışan vardı.* B.Talıblı. *Gənclərin gücü ilə bir neçə dəfə iməcilik keçirilib, idman meydanı düzəldi.* Ə.Sadıq. *Nahiyənin rəhbərləri bu cümə iməcilik təşkil edib, dərənin üstündən körpü salırdılar.* Ə.Əbülhəsən. ☐ **İməcilik etmək** – birinə kömək məqsədi ilə bir işi birlikdə görmək, elliklə köməkləşib yerinə yetirmək. *Lakin yetimin uşaqlığını camaat nəzərə alaraq, hər il iməcilik edib onun əkininə, biçininə kömək edərdi.* Çəmənzəminli.

**İMƏK**: **iməyə düşmək** – iməkləməyə başlamaq. *İməyə düşən uşaq .. yəhərin qaşından tutdu.* S.Rəhimov.

**İMƏKLƏMƏ** "İmələmək"dən *f.is.*

**İMƏKLƏMƏK** *f.* Əllər və dizlər üzərində hərəkət etmək. *Nə isə, vaxt yetişdi, gərək uşaq iməkləsin, yerisin, gülsün, danışsın, şad olsun..* N.Nərimanov. [Atakişi:] *Ay sənə qurban inəklər; Bu balam haçan iməklər.* C.Cabbarlı. *Əllərin qurtardı iməkləməkdən; Ayağın yer tutdu, a qızım, sənin.* B.Vahabzadə. // Üzüqoylu sürünə-sürünə hərəkət etmək, yerlə sürünmək. *Dəyirman üstə ləklər; Çırmanıb ağ biləklər; Oğlan qızdan ötəri; Dizi-dizi iməklər.* (Bayatı). [Döyüşçülər] *bəzən uşaq kimi iməkləyir, bəzən də şahin kimi uçurdular.* Ə.Vəliyev.

**İMƏKLƏTMƏ** "İməklətmək"dən *f.is.*

**İMƏKLƏTMƏK** *f.* Uşağın iməkləməsinə kömək etmək, iməkləməyə öyrətmək.

**İMHA** *is.* [*ər.*] Məhv etmə, tələf etmə. *Bunların içindəki müzürr mikrobların imhası üçün oralar hər gün .. dezinfeksiya olunaraq, son dərəcə pak və təmiz saxlanmaqdadır..* T.Ş.Simurq.

**İMİC** *is.* [*ing.*] 1. Fikri surət, fikri təsəvvür. 2. Rəmz, simvol.

**İMİR** *is. məh.* Şah arı.

**İMİRÇİMƏ** "İmirçimək"dən *f.is.*

**İMİRÇİMƏK** *f. dan.* İylənmək, xarab olmağa başlamaq, turşumaq, ağırlaşmaq. *Qatıq imirçiyib. Pendir imirçiyib.*

**İMİRÇİMİŞ** *f.sif. dan.* Ağırlaşmış, xarab olmuş, turşumuş, iylənmiş. *İmirçimiş yağ.*

**İMİŞ** Qoşulduğu sözü keçmiş zamana bağlayaraq ona rəvayət mənası verən bağlama. *Şəhər çox böyük imiş. Onun qisməti belə imiş. – Hər kəs* [Zeynala] *adi bir idarə məmuru kimi baxır imiş.* S.Hüseyn. *C.Məmmədquluzadənin təsvirinə və tarixi sənədlərə görə o zaman Azərbaycan dilində qəzet çıxarmaq çox çətin məsələ imiş.* M.İbrahimov. *Ancaq indi Kərimə əyan oldu ki, bura nə imiş.* Mir Cəlal.

**İMİTÁSİYA** [*lat.*] 1. Oxşatma, bənzətmə; bir şeyin saxtasını düzəltmə. *Mərmər imitasiyası* (mərmərə oxşadılmış şey). *Dəri imitasiyası* (dəriyə oxşadılmış material).

2. *mus.* Musiqi motivinin bir interval yuxarı və ya aşağı olaraq başqa səslə təkrarı; təqlid. *Çox zaman əsas melodiya ardıcıl olaraq başqa səslərdə ya eyni ilə, ya da döndərmə yolla təkrar edilə bilər. Polifonik musiqidə çox intişar tapan bu üsula imitasiya* (*təqlid*) *deyilir.* Ə.Bədəlbəyli.

**İMKAN** *is.* [*ər.*] 1. Hər hansı şərait daxilində bir işin həyata keçirilə bilməsi, mümkünlük, mümkün olma. *Nə dildə olsa olsun elm olsun xəlqi-aləmdə; Deyildir bir dilə məxsus, var hər dildə imkanı.* S.Ə.Şirvani. *..Kömək etmək imkanı əldə ikən, bu*

*vəzifədən boyun qaçırmaq .. insanlıq sifətini itirmək deməkdir.* M.S.Ordubadi. *..Asanlıqla odun gətirməyə imkan vardı.* Ə.Əbülhəsən. // Əlverişli şərait. ◻ **İmkan gözləmək** – bir işi həyata keçirmək üçün əlverişli şəraitin yaranmasını gözləmək, fürsət gözləmək. **İmkan olmamaq** – mümkün olmamaq, müyəssər olmamaq. *Səni görsəm özüm ilə həsədimdən ölərəm; Bu səbəbdən mənə vəslin dəxi imkan olmaz.* S.Ə.Şirvani. **İmkan tapmaq** – bir işi həyata keçirmək üçün əlverişli yol tapmaq, fürsət tapmaq. [Qaçaqlar] *kütləvi talana imkan tapa bilmədilər.* M.S.Ordubadi. [İnsanlar] *boğazlarına keçmiş fəlakət zəncirini qırıb atmağa heç bir yol və imkan tapa bilmirdilər.* Ə.Abasov. **İmkan verməmək** – mane olmaq, yol verməmək, qoymamaq. **İmkan yaratmaq (vermək)** – bir işi həyata keçirmək üçün əlverişli şərait yaratmaq, yol vermək. *Ayıq ol, döyüşə yaratma imkan; Hər kiçik iş üçün tökülməsin qan.* A.Şaiq. *Qadınına gəldikdə onun yaşaması üçün geniş imkan yaratmalısan.* M.S.Ordubadi. **İmkan yoxdur** – mümkün deyil, ola bilməz, imkan xaricindədir.

2. Bir şeyin həyata keçməsinə kömək edən əlverişli şərait. *Maddi imkanlar. Yaşamaq, çalışmaq, oxumaq üçün hər cür imkan və şərait yaranmışdır. – Təsərrüfatın daxili imkanlarından geniş istifadə edilir.* (Qəzetlərdən). // İqtidar, qüvvə, vəsait. *Mirzə Səfərin vəziyyəti mənə aydın məlumdur və uşaqlarını öz xərci ilə oxutmağa onda imkan var.* Ə.Haqverdiyev.

◊ **İmkan daxilində** – nə qədər imkan varsa, güc çatdığı qədər. *..İmkan daxilində bəzi ədəbi mülahizələr söyləmək istəyirəm.* S.Rəhimov. **İmkan xaricində olmaq** – mümkün olmamaq, həyata keçirməyə güc, bacarıq çatmamaq, bacara bilməmək. *..O zamankı dünyanın ən böyük paytaxtını piyada gəzmək imkan xaricində idi.* M.S.Ordubadi.

**İMKANLI** *sif.* İmkanı olan, mümkünü olan, iqtidarı olan.

**İMKANSIZ** *sif.* 1. İmkanı olmayan, mümkünü olmayan. *İmkansız adam.*

2. **İmkansızdır** şəklində – mümkün deyil, qeyri-mümkündür, çox çətindir. *Xəstəliyin əlacı imkansızdır. Öhdəsindən gəlmək imkansızdır.* ◻ **İmkansız olmaq** – mümkün olmamaq. *Əhali o qədər qəzəblənmişdi ki, onların qabağını almaq imkansızdı.* P.Makulu.

**İMKANSIZLIQ** *is.* Qeyri-mümkünlük, mümkün olmama, imkan olmama, çox çətin olma; bir işin yerinə yetirilməsi üçün imkan və şərait olmadığı hal. *Gözəl Təliə, insanı bu qədər düşünməyə məcbur edən yeganə bir şey vardısa, o da imkansızlıqdır.* M.S.Ordubadi.

**İMLA** *is.* [*ər.*] 1. Hər bir ədəbi dil üçün qəbul edilmiş vahid və düzgün yazı sistemi; orfoqrafiya. ◻ **İmla qaydaları** – hər hansı bir dildə düzgün yazma qayda və üsulları. *İmla dərsi. İmla xatası. – Möhtərəm ədibimiz ingilislərin imlasının adını qoyur "əcib", amma bizim imlaya heç olmasa "bir az əcib" də demək istəmir.* C.Məmmədquluzadə.

2. Şagirdlərə orfoqrafiya vərdişlərini və savadlı yazmağı öyrətmək məqsədi ilə onlara deyib yazdırma işi. ◻ **İmla demək** – deyib yazdırmaq, diktə etmək. *Müəllim imla deyir, uşaqlar da qələmlərini mürəkkəbə batırıb başlarını yana əyərək yazırdılar.* M.Arif.

**İMMANÉNT** *sif.* [*latıncadan*] *kit.* Bir şeyin və ya hadisənin daxilən öz təbiətinə xas olan, ondan doğan; daxili. *Kapitalist istehsalının immanent qanunları.*

**İMMİQRÁNT** *is.* [*lat.*] Mühacir, bir ölkədən köçüb başqa ölkədə yaşayan.

**İMMÚN** *is.* [*latıncadan*] *tib. biol.* Yoluxan xəstəliklərə və müəyyən zəhərlərə qarşı qorunma qabiliyyəti olan. *İnsanın ömrü ərzində keçirdiyi müxtəlif xəstəliklərin nəticəsində onun qanında həmin xəstəlik törədən mikroblara qarşı xüsusi immun – bioloji maddələr əmələ gəlir ki, bunlar da orqanizmi eyni bir xəstəliklə ikinci dəfə xəstələnməkdən qoruyur.* H.Tağıyev.

**İMMUNİTÉT** [*latıncadan*] *tib. biol.* Orqanizmin yoluxma xəstəliyinə tutulmamaq qabiliyyəti.

**İMMUNİZÁSİYA** [*lat.*] *tib. biol.* İmmunitet yaratma (b a x **immunitet**).

**İMMUNLUQ** *is. tib. biol.* Yoluxucu xəstəliklərə və bəzi zəhərlərə qarşı qoruna bilmə qabiliyyəti.

**İMPERÁTOR** [*lat.*] Padşahın, hökmdarın ən yüksək titulu və bu titulu daşıyan şəxs;

padşah. [Bağır xan:] *Siz imperator zabitini soymaqmı istəyirsiniz?* E.Sultanov.

**İMPERATORLUQ** *is.* 1. İmperatorun titulu, adı. // İmperatorun hökmdarlıq etdiyi dövr, müddət.

2. Bir imperatorun idarəsi altında olan dövlət, ölkə; hökmdarı imperator titulu daşıyan dövlət. *Roma imperatorluğu. – III Dövlət duması çar imperatorluğunun tərkibinə daxil olan millətlərin ən ibtidai hüququnu daha artıq məhdud edən bir sıra qanunlar keçirtdi.* "SSRİ tarixi".

**İMPERATRİÇƏ** *is.* 1. İmperatorun arvadı.

2. Qadın imperator.

**İMPERİÁL** [*lat.*] *köhn.* 10 manatlıq rus qızıl pulu (1755-ci ildən); 1897-ci ildən sonra (inqilaba qədər) 15 manat dəyərində olan qızıl pul. *Pinəçilər bafta taxar boynuna; İmperial tökər vərəq oynuna.* Q.Zakir. [Xonça qabının] *içinə oğlan evi bir əlbəsəlik ipək parça, iki imperial və onun əmsalı bir şey qoyub qaytaracaqlar.* R.Əfəndiyev. [Muzdur] *iki yüz imperialın neçə manat olduğunu ha çalışdısa, hesab edə bilmədi.* S.M.Qənizadə.

**İMPERİALÍST** [*fr.*] 1. İmperializm və təcavüz siyasəti yürüdən inhisarçı kapitalın nümayəndəsi olan iri kapitalist. *Müharibə qızışdıran imperialistlər.*

2. İmperialist monopoliyalar.

**İMPERİALÍZM** [*fr.*] Kapitalizmin XIX əsrin axırında və XX əsrin əvvəlində daxil olduğu ən yüksək və axırıncı mərhələsi; iri inhisarlarla səciyyələndirilən xammal mənbələri və xarici bazarlar uğrunda özgə ölkələri tutmaq, özgə xalqları istismar etmək, dünyanı yenidən bölüşdürmək üçün böyük kapitalist ölkələri arasındakı müharibə siyasəti.

**İMPÉRİYA** [*lat.*] 1. Başında imperator duran monarxist dövlət.

2. İri imperialist müstəmləkəçi dövlət. *Britaniya imperiyası. – 1905-ci il inqilabı Rusiya imperiyasında yaşayan bütün xalqların həyatında yeni dövr açdı.* M.İbrahimov.

**İMPİÇMENT** *is.* [*ing.*] 1. Vəzifəsindən kənarlaşdırma.

2. Mühakimə etmək.

**İMPORT** [*ing.* əsli *lat.*] b a x **idxalat**.

**İMPOTENSİYA** *is.* [*lat.*] Cinsi gücsüzlük.

**İMPRESSARİO** *is.* [*ital.*] Konsert, tamaşa, qastrollar təşkil edən işbaz.

**İMPRESSİONÍST** [*fr.*] 1. İmpressionizm tərəfdarı olan rəssam, musiqiçi, yazıçı.

2. İmpressionizm mahiyyətində olan, impressionizm üçün səciyyəvi olan; şəxsi təəssürat və əhval-ruhiyyəyə əsaslanan. *İmpressionist əsər. İmpressionist musiqi. Ədəbiyyatda impressionist meyillər.*

**İMPRESSİONÍZM** [*fr.*] XIX əsrin ikinci yarısında burjua incəsənətində meydana gəlmiş cərəyan (bu cərəyan tərəfdarları realizmi rədd edir, ictimai məsələlərdən qaçır, əsərlərində şəxsi əhval-ruhiyyə və təəssüratlarını verməyə çalışır və məzmunun zərərinə olaraq formaya həddindən artıq fikir verirdilər).

**İMPROVİZÁSİYA** [*lat.*] Hazırlaşmadan şeir, ya nitq söyləmə, hava oxuma və ya musiqi çalma; irtical. *Vəznsiz musiqiyə bunlar daxildir: ladlar üzərində vokal və çalğı gəzişməsi* (*improvizasiya*). Ü.Hacıbəyov.

**İMPROVİZÁTOR** [*lat.*] İmprovizasiya qabiliyyəti olan adam: hazırlaşmadan şeir və ya nitq söyləmək, musiqi yaradıb çalmaq qabiliyyəti olan adam. *Mahir improvizator.*

**İMPROVİZATORLUQ** *is.* İmprovizasiya qabiliyyəti; hazırlaşmadan döşdən şeir, nitq söyləmək, musiqi yaradıb çalmaq.

**İMPULS** [*lat.*] *kit.* 1. Hər hansı bir hərəkəti doğuran daxili səbəb, təkan. *Yaradıcılıq impulsu. İradə impulsu.*

2. *fiz.* Cismin kütləsi ilə sürətinin hasilinə bərabər olan hərəkət miqdarı.

**İMRƏNDİRMƏ** "İmrəndirmək"dən *f.is.*

**İMRƏNDİRMƏK** *f.* Həvəsləndirmək, tamaha salmaq, tamahsılandırmaq.

**İMRƏNMƏ** "İmrənmək"dən *f.is.*

**İMRƏNMƏK** *f.* Həvəslənmək, tamaha düşmək, iştahaya gəlmək, ağzı sulanmaq; arzu və həvəs oyanmaq.

**İMRİK** *is. məh.* Əzilmiş, döyülmüş şeyin içində qalan iri dənəsi. *İmrik duz.*

**İMRİKLƏMƏ** "İmrikləmək"dən *f.is.*

**İMRİKLƏMƏK** *f. məh.* Buğda, duz və bu kimi şeyləri tam döyməmək, narın etməmək. *Duzu imrikləmək. Arpanı imrikləmək.*

**İMRİKLƏTMƏ** "İmriklətmək"dən *f.is.*

**İMRİKLƏTMƏK** bax **imriklətdirmək**. *Yarma xəşili bişirmək üçün buğdanı imriklətmək.*

**İMSİK** *sif.* İy bilən, iyi tez duyan. *İmsik adam.*

**İMSİLƏMƏ** "İmsiləmək"dən *f.is.*

**İMSİLƏMƏK** *f. məh.* İyləmək, qoxulamaq, iy almaq. *Külək də ac it kimi vurnuxur o küçədən bu küçəyə; Qapıları, divarları imsiləyir.* R.Rza. *İmsilədi o, havanı; Buynuzunu sürtdü daşa.* Z.Xəlil.

**İMSİLƏNMƏ** "İmsilənmək"dən *f.is.*

**İMSİLƏNMƏK** *f.* İy duymuş kimi ora-buranı iyləmək. *Sallayıb başını imsilənərək; Qapının ağzında gərnəşir köpək.* S.Vurğun.

**İMTAHAN** *is.* [*ər.*] 1. Hər hansı bir fənn üzrə keçirilən yoxlama sınağı. *Yaz-yay imtahanları. İmtahana hazırlaşmaq. İmtahan komissiyası. – İmtahan məclisi qurulmuşdur; Zalda skamyalar qoyulmuşdur.* A.Səhhət. *İmtahan söhbəti indi hər yerdə ən şirin söhbətdir.* Mir Cəlal. *..Səhər saat doqquzda riyaziyyatdan yazılı imtahan başlandı.* İ.Əfəndiyev. ◻ **İmtahan eləmək (etmək)** – hər hansı bir fənn üzrə tələbənin, şagirdin biliyini yoxlamaq. *Tələbələri imtahan etmək. – Dərs demək istəyirəm; İmtahan edin məni.* B.Vahabzadə. **İmtahan vermək (tutmaq)** – hər hansı fənn üzrə yoxlama sınağından keçmək. *Elm öyrən, imtahan ver; Öz fəzlini nişan ver.* M.Ə.Sabir. *"Həblülmətin" yazır ki, Firəngistanda birisi ki istəyir alim ola, gərək gecələr yatmayıb zəhmət çəkə, elm oxuya, bir klasdan o biri klasa keçə, axırda imtahan tuta və şəhadətnamə ala.* C.Məmmədquluzadə. [Qəhrəman] *imtahan verib təzə açılan darülmüəlliminə daxil oldu.* S.Rəhimov.

2. *məc.* Sınaq, sınama, yoxlama, sınaqdan keçirmə. *Məni zındıq oxurlar cümlə aləm əhli, lakin mən; Mücərrəd cövhərəm kim, imtahana ehtiyacım yox.* S.Ə.Şirvani. ◻ **İmtahan ayağında** – gərgin zamanda, çətin vəziyyətdə, bərk ayaqda, sınaqda. *Ellərin qarşısında imtahan ayağında; Rəvamıdır mən solum açılmamış çiçək kimi.* S.Rüstəm. **İmtahan eləmək** – sınamaq, yoxlamaq, sınaqdan keçirmək, təcrübə eləmək. *Eşq əhli məhəbbət etsə izhar; Əvvəl onu imtahan edər yar.* Füzuli. *Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm; Fəda olum sənə, gəl, eylə imtahan, ölürəm.* X.Natəvan. [Qətibə:] *Mən bu gözəllik vasitəsilə iqbalımı bir daha imtahan edəcəyəm.* M.S.Ordubadi. **İmtahana çəkmək** – bax **imtahan eləmək.** *Sən demə, əmisi doğrudan da İbrahimi imtahana çəkmək istəyirmiş ki, görsün İbrahim nə deyəcək.* (Nağıl). *Qədim əyyamda bir qıza elçi gəlsəydi, o qızı bir neçə imtahana çəkərdilər.* R.Əfəndiyev. [Hacı Murad:] *Yaxşısı budur ki, elə bu saat imtahana çəkim.* S.S.Axundov. **İmtahana düşmək** – yoxlanmaq, sınanmaq, sınaqdan keçirilmək. *Eldən yana düşmüşəm; Nahaq qana düşmüşəm; Yar məni bərkə çəkib; İmtahana düşmüşəm.* (Bayatı). **İmtahandan çıxmaq** – sınaqdan yaxşı çıxmaq, yoxlamadan keçmək. *Qorxub çəkilmədik ölümdən, qandan; Çıxdıq illər boyu çox imtahandan.* S.Vurğun. *Dostluq var ki, zamanın imtahanından çıxa bilmir.* R.Rza. *Hər şeyə qadir insan; Yer üzündə beləcə; Çıxdı min imtahandan.* B.Vahabzadə. // *məc.* Həyati çətinliklər, ağır günlər. *İrəlidə hələ böyük imtahanlar var.* S.Vəliyev.

**İMTAHANEDİCİ** *sif.* 1. İmtahan edən, imtahan qəbul edən. *İmtahanedici komissiya.*

2. *məc.* Sınayıcı, yoxlayıcı, sualedici. *Polad bir dəqiqə Məşədi bəyə imtahanedici gözlərlə baxdı, sonra ətrafına boylanaraq, otaqda özlərindən başqa heç kim olmadığını görüb dedi..* M.Hüseyn.

**İMTAHANQABAĞI** *sif.* İmtahan qarşısında olan, imtahan başlanmamış. *İmtahanqabağı hazırlıq. İmtahanqabağı mühazirələr.*

**İMTAHANSIZ** *zərf* İmtahan vermədən, imtahan olmadan. *İmtahansız qəbul olunmaq. İmtahansız sinifdən-sinfə keçmək.*

**İMTİNA** [*ər.*]: **imtina etmək** – boyun qaçırmaq, çəkinmək, istəməmək, rədd etmək. *Yeməkdən imtina etmək. Qonaqlıqdan imtina etmək. – Rzaqulu xan səfarət ümurunda təcrübəm yox deyə, səfarətdən büsbütün imtina edirdi.* M.S.Ordubadi. *Mehriban açıqdan-açığa çocuqlarından imtina edirdi.* S.Hüseyn. *Bir neçə gün sonra Ulduza müalicə və istirahət üçün arxaya getmək təklif edildikdə, o imtina etdi.* Ə.Məmmədxanlı. // Könüllü

olaraq əl çəkmək. *Bu xəzinədən imtina etmək üçün azmı cəsarət lazım idi?* S.Vəliyev.

**İMTİYAZ** *is.* [*ər.*] 1. Müstəsna hüquq. // Üstünlük, güzəşt. *Müharibə əlillərinə verilən imtiyazlar. – Məsmə, bir ittifaq üzvünün istifadə edə biləcəyi bütün hüquq və imtiyazlardan istifadəyə çalışır.* S.Hüseyn.

2. *iqt.* Ölkə daxilində sənaye müəssisələri yaratmaq, onları işlətmək, mədən çıxarmaq və s. üçün dövlət tərəfindən ayrı-ayrı şəxslərə, şirkətlərə və ya xarici firmalara verilən hüquq. *Dəmiryolu çəkmək üçün imtiyaz.*

**İMTİYAZLI** *sif.* 1. İmtiyazdan istifadə edən, imtiyazı olan, müstəsna hüququ olan (b a x **imtiyaz** 1-ci mənada). ..*Əgər Qafqaz* [Finlandiya] *kimi imtiyazlı və həm müstəqil bir ölkə olsaydı, ana dilində açılmış məktəblərdən arzu olunan* [nəticə] *və məhsulatı bilatərəddüd gözləmək olardı.* Ü.Hacıbəyov.

2. Güzəştli. *İmtiyazlı şərtlər. İmtiyazlı dəmiryol bileti.*

3. Müstəsna hüquqlardan istifadə edən, yuxarı siniflərə mənsub olan; seçilmiş. *Bütün imtiyazlı təbəqələrin ləğvi. – Kasıbın toyuna seçilmiş, imtiyazlı mənsəb, sərvət sahibləri çağırılmazdı.* H.Sarabski.

**İMTİYAZNAMƏ** *is.* [*ər.* imtiyaz və *fars.* namə] İmtiyaz kağızı, imtiyaz müqavilənaməsi (b a x **imtiyaz** 2-ci mənada).

**İMTİYAZSIZ** *sif.* Heç bir imtiyazı, xüsusi və müstəsna hüququ olmayan.

**İMTİZAC** [*ər.*] 1. Qarışma, qarışa bilmə, bir neçə maddənin qarışıb bir maddə əmələ gətirməsi. *Kimyəvi imtizac.*

2. Bir-birinə uyğun gəlmə, bir-biri ilə tutma, bir-biri ilə qaynayıb-qarışma; uyğunluq, ahəng. *Rənglərin imtizacı.*

3. *məc. köhn.* Bir-biri ilə uyuşma, yola getmə, keçinmə. *Aralarında imtizac yoxdur.*

**İMZA** *is.* [*ər.*] 1. Bir məktubun, sənədin və s.-nin altında öz dəst-xətti ilə adını və ya familiyasını yazma, qol çəkmə, qol qoyma; qol. *Fəxrəddinin və Ələddinin imzası ilə şəhərə belə bir bəyannamə buraxılmışdı.* M.S.Ordubadi. [Gəldiyev] *direktor gələndə kağızları kargüzara verdi, imza üçün göndərdi.* Mir Cəlal. ☐ **İmza etmək (atmaq)** – imzalamaq. *Sənədləri imza etmək. Çeki imza etmək.* – [Musa:] *İmza da atmıram, pul da almayacağam.* S.Rəhman. *Elmar kağıza imza ataraq Laləyə verir.* İ.Əfəndiyev.

2. Təxəllüs, ləqəb mənasında. *C.Məmmədquluzadə "Molla Nəsrəddin" imzası ilə müntəzəm surətdə felyetonlar, baş məqalələr dərc edirdi.* M.İbrahimov.

**İMZALAMA** "İmzalamaq"dan *f.is.*

**İMZALAMAQ** *f.* Altında öz familiyasını (ya adını) yazmaq, öz imzasını qoymaq, qol çəkmək. *Kərbəlayı Xəlil .. teleqrafçının verdiyi kağızı türkcə imzaladı və teleqrafçıya qaytararaq iki şahı da pul verdi.* T.Ş.Simurq. *Sərvərov əmri götürüb imzaladı.* Mir Cəlal. [Bənövşə:] *Komissiya aktı imzaladı. Tez köçün.* S.Rəhman.

**İMZALANMA** "İmzalanmaq"dan *f.is.*

**İMZALANMAQ** *məch.* İmza edilmək, qol çəkilmək, qol qoyulmaq. *Müqavilə imzalandı. – Əmrnamə yazılmış və Balacayev tərəfindən imzalanmışdı.* S.Rəhimov.

**İMZALANMIŞ** *f.is.* İmza edilmiş, qol qoyulmuş, qol çəkilmiş. *İmzalanmış qərar. İmzalanmış kağızlar.* – [Sabirin] *sabiqdə bəzi müstəar adlar ilə imzalanmış abdar, xoşməzmun və mövzun kəlamları "Molla Nəsrəddin" səhifələrində dərc olunub.* F.Köçərli.

**İMZALATDIRMA** "İmzalatdırmaq"dan *f.is.*

**İMZALATDIRMAQ** b a x **imzalatmaq**.

**İMZALATMA** "İmzalatmaq"dan *f.is.*

**İMZALATMAQ** *icb.* Qol çəkdirmək, imza etdirmək. *Baş mühasib .. içəri girdi, əlindəki sənədləri idarə müdirinə imzalatdırıb qapıya yaxınlaşırdı ki, Surxay soruşdu..* M.Süleymanov.

**İMZALI** *sif.* Qol çəkilmiş, imzalanmış, imza ilə təsdiq edilmiş. *İmzalı məktub. İmzalı sənəd.*

**İMZASIZ** *sif.* Altında imza olmayan, imza edilməmiş, qol çəkilməmiş. *İmzasız məktublar.*

**İNABƏT** *is.* [*ər.*] *köhn.* Tövbə, tövbə etmə.

**İNAD** 1. *sif.* Əsassız olaraq dediyini yeritməyə çalışan, heç bir güzəştə getmək istəməyən; tərs, höcət. *İnad adam. İnad xasiyyət.* – [Qulu] *xəsis, tamahkar, heç bir şeyə güzəştə getməyən, tərs və inad bir adam idi.* A.Şaiq. [Böyükxanım:] *Bax, özün bil, teleqram edərəm gəlsinlər! Amma Qulam xan da*

*inadın birisidir.* M.S.Ordubadi. ☐ **İnad etmək (eləmək)** – 1) sözünün üstündə durmaq, israr etmək, sözündən geri çəkilməmək; 2) tərslik etmək, höcət göstərmək, öz dediyini yeritməyə çalışmaq. *Gülsəhər inad eləyir, Dildar isə hədə-qorxu gəlirdi.* Ə.Vəliyev. **İnad göstərmək** – əzmli olmaq, dəyanət göstərmək, əzmindən dönməmək, sözünün üstündə durmaq, dediyindən əl çəkməmək. *Doktor Qəbzi bəy yay zamanı Xansaray yaylağına gəlməməkdə elə bir inad göstərdi ki, hətta onun öz yavuq qohum-əqrəbası da bu işə məəttəl qalmışdılar.* C.Məmmədquluzadə. **İnad yeritmək** – bax **inad etmək**. [Həmzə:] [Səriyyə] *də bizim ilə inad yeritsə, onda gərək bizə papaq haram olsun.* C.Cabbarlı. **İnada durmaq** – bax **inad etmək**. **İnada düşmək** – acığa düşmək, tərslik etmək, tərsliyi tutmaq. *..Əgər mənim uşaqlarımın biri inada düşüb, məni qəsd ilə incitmək istəyir, qoy burada bir söz deməyim..* C.Məmmədquluzadə. **İnadı yerə qoymaq** – inadından, tərsliyindən əl çəkmək, razı olmaq. [Hacı:] *Sən olasan Allah, ay Sərdar, – dedi, – bu inadı yerə qoy, bu işlərə bir əncam çək!* P.Makulu. // *İs. mənasında.* İnad adam, tərs adam, höcət adam. *Gülsabahın atası çox inad adamdı.* Ə.Vəliyev. [Əhməd:] *Hacı, inadı var, xahiş eləyərsən, oxumaz. Nə illah eləyirsən, oxumayanda oxumaz! İnaddı!* Mir Cəlal.

2. *is.* Əzm, dəyanət, səbat; əzmindən dönməmə. *Belə hadisələr bizim inadımızı daha da artırmalıdır.* H.Nəzərli. *Yerli əhalinin inadından .. qəzəblənmiş şah vəziri Taygöz Yusifi çağırıb kimsəyə aman verməməyi ona əmr etdi.* İ.Əfəndiyev.

3. **İnadla** şəklində *zərf* – mətanətlə, əzmlə, səbatla. *İnadla mübarizə etmək. – O deyir: – Mənimdir bu ana torpaq; Vuruşur inadla əlində yaraq.* M.Rahim. *..Məhsuldar çöllər yorulmadan və inadla çalışan insanlarla doludur.* M.İbrahimov. *Tez-tez çay keçmək nə qədər yorucu olsa da, onlar inadla irəliləyirdilər.* Ə.Vəliyev.

**İNADCIL** bax **inadkar**. *Hər şeydə möhkəm, sözünün üstə duran, inadcıl, amansız olan Baxış bəyin bir zəif cəhəti vardı: çox şorgöz idi.* Ə.Abasov.

**İNADCILLIQ** bax **inadkarlıq.**

**İNADÇI** bax **inadkar.** [Mehribanın] *nöqsanı yalnız savadsızlığı, eyni zamanda inadçı əsəbiliyi idi.* S.Hüseyn.

**İNADÇILIQ** bax **inadkarlıq**. *Qaraca qızın təbiətində inadçılıq vardı.. Yusifdən nə qədər kötək yeyirdisə də, yenə tərsliyindən əl götürməzdi.* S.S.Axundov.

**İNADEDİCİ** bax **inadkar**.

**İNADKAR** *sif.* [*ər.* inad və *fars.* ...kar] İnad, inadcıl, tərs, dediyindən əl çəkməyən. *Polis və qoşunun təzyiqinə baxmayaraq, qəhrəman və inadkar fəhlələr mədən dairəsindən çıxmadılar.* M.S.Ordubadi. *Şair ən inadkar bir çocuq kimi; Endi xəyalının dərinliyinə.* S.Vurğun. *Səlimnaz arvad* [oğlunun] *inadkar olduğunu çoxdan bildiyi üçün, daha təkid eləmədi, gəlib oğlu ilə yanaşı yeriməyə başladı.* M.Hüseyn.

**İNADKARCASINA** *zərf* Tərslik edərək, inad göstərərək, dediyindən əl çəkməyərək. *İnadkarcasına demək. – Həbib Mədədin fikri ilə razı idi. Ancaq inadkarcasına öz sözlərini təkrar edirdi..* Ə.Vəliyev.

**İNADKARLIQ** *is.* 1. İnadkar adamın xasiyyəti; tərslik, inad. *İnadkarlıq etmək. – Qızın inadkarlığı; Çox ağır gəldi ona.* B.Vahabzadə.

2. Sözünün üstündə durma, əzmindən dönməmə; dəyanət, səbat.

**İNADLI** *sif.* 1. Tərs, höcət, kəc, inadcıl, dediyindən əl çəkməyən. *Mehriban inadlı bir qız idi.* S.Hüseyn. *Çoxlarının bezdiyi və uzaq qaçdığı inadlı, şıltaqçı və ağlağan uşaqları Nazimə sanki əfsun ilə ələ alır*(*dı*). Mir Cəlal.

2. Əzmli, dəyanətli, səbatlı, qətiyyətli. *İnadlı mübarizə. İnadlı müqavimət.*

**İNADLILIQ** *is.* 1. İnadlı adamın hal və keyfiyyəti; inadcıllıq.

2. İşində və ya sözündə dəyanət, möhkəmlik, dayanıqlıq, əzm.

**İNAQ** *is. tib.* Uşaqlarda qırtlağın iltihabı. *İnaq olmaq.* ☐ **İnaq(ını) vurmaq** – keçmişdə xalq arasında: inaq olmuş uşağın başını yüngülcə çərtmək.

**İNAQLI** *sif.* İnaq xəstəliyinə tutulmuş. *İnaqlı uşaq.*

**İNAUQURASİYA** *is.* [*ing.*] Prezidentin rəsmən öz vəzifəsinə başlaması münasibəti ilə bağlı keçirilən mərasim.

**İNAM¹** *is.* 1. İnanma, etibar. *İnam olmayan yerdə iman olmaz.* (Ata. sözü). *İlk müvəffəqiyyət məndə inam və ruh yüksəkliyi doğurdu.* A.Şaiq.

2. **İnamla** şəklində *zərf* – bir şeyə ürəkdən inanaraq, özünə inanaraq, özünə güvənərək, əzmlə, mətanətlə, qətiyyətlə, dönmədən. *İnamla cavab vermək. İnamla irəliləmək. – O, sözlərini böyük bir inamla deyib qurtararkən sakit gözləri parıldadı.* M.Hüseyn. *Qəhrəman məktəbdə dərin bir inamla çalışır.* S.Rəhimov. *Mən inamla irəliləyən Rəşidi addım-addım izləyirdim.* M.Rzaquluzadə.

**İNAM²** [*ər.*] b a x **ənam.** [Məstəli şah:] *Xanım, divlərin əlmuzdunu, inamını kərəm edin!* M.F.Axundzadə. ☐ **İnam etmək (eyləmək)** – b a x **ənam eləmək** ("**ənam**"da). *İnam edibən ona bəsi mal; Leyli tələbinə qaldı irsal.* Füzuli. *O ki bizə meyvə inam eyləmiş; Vaqif ona peşkəş sərin göndərmiş.* M.P.Vaqif. *Söylədilər bəs ona inam edək; Töhfeyi-layiq ona ikram edək.* S.Ə.Şirvani.

**İNAMLI** *sif.* İnamı olan, qətiyyətli, əmin, arxayın, xatircəm. *Onun ılıq səsi, inamlı səsi; Şəfəqi, şöləsi, məhrəm nəfəsi; Mənə qüvvə verdi, gəzdim, dolandım..* Ə.Cavad. [Fərhadoğlu] *ağır və inamlı addımla gəzib əlini yenə Əmiraslan babanın çiyninə qoydu.* S.Rəhimov. *İnamlı və şad bir nəzərlə dostumun üzünə baxdım.* M.Rzaquluzadə.

**İNAMSIZ** *sif.* İnamı olmayan, inanmayan, etibar etməyən.

**İNAMSIZLIQ** *is.* İnam olmama, etibar olmama; inam, etibar yoxluğu.

**İNANDIRICI** *sif.* və *zərf* İnandıran, qaneedici, sübutlu, əsaslı, tutarlı. *İnandırıcı dəlillər. İnandırıcı sübut. – C.Məmmədquluzadə Novruzəlilərin ürəkdağlayan, yazıq, ağır və köməksiz həyatlarını çox təbii və inandırıcı təsvir edir.* M.İbrahimov. *Şeydanın həm elmi əsasları, həm də fərziyyələri* [Qədirə] *çox inandırıcı görünürdü.* M.Hüseyn.

**İNANDIRICILIQ** *is.* Qaneedicilik, sübutluluq, əsaslılıq, tutarlılıq. *Dəlillərin inandırıcılığı. Faktların inandırıcılığı.*

**İNANDIRILMA** "İnandırılmaq"dan *f.is.*

**İNANDIRILMAQ** "İnandırmaq"dan *məch.*

**İNANDIRMA** "İnandırmaq"dan *f.is.*

**İNANDIRMAQ** *f.* İnanmasına nail olmaq, inanmasına çalışmaq, birində bir şey haqqında inam yaratmaq; qane etmək. *Haqlı olduğuna inandırmaq. Vəziyyətin düzələcəyinə inandırmaq.– Füzuli, eşqə mühlik dərdim, ol məhvəş inanmazdı; Bihəmdüllah ki, can vermək təriqilə inandırdım.* Füzuli. *Mən məzarında şəm yandırıram; Yarımın ruhunu inandırıram.* S.Ə.Şirvani. *Arvad məni inandırır ki, bir çox ac itlər və heyvanlar öz rizqlərini zibildə tapırlar, onları doydurmaq da savabdır.* C.Məmmədquluzadə.

**İNANIQLI** b a x **inandırıcı.**

**İNANILACAQ** *sif.* İnanıla bilən, doğru şey kimi qəbul edilə bilən; etibar edilə bilən. *İnanılacaq adam deyil.*

**İNANILMA** "İnanılmaq"dan *f.is.*

**İNANILMAQ** *məch.* Etibar edilmək; doğru deyə qəbul olunmaq, doğru nəzəri ilə baxılmaq.

**İNANILMAZ** *sif.* İnanılması mümkün olmayan, etibar edilməz, ağlabatmaz. *Bu sözlər əvvəlcə mənə inanılmaz* (z.) *göründü.* M.Rzaquluzadə.

**İNANILMAZLIQ** *is.* İnanılması mümkün olmama, etibar edilə bilməmə.

**İNANILMIŞ** *f.sif.* Etibarlı, etibar edilə bilən, etibara layiq. *İnanılmış adam.*

**İNANMA** "İnanmaq"dan *f.is.*

**İNANMAQ** *f.* 1. Bir işin, sözün və s.-nin yəqinliyinə, doğruluğuna qəti əmin olmaq, arxayın olmaq, yəqin etmək. *Gülnaz çölə həmişə Laçınla yanaşı gedər, onun əlli-ayaqlı olduğunu görüb, bacarığına ürəkdən inanardı.* M.Hüseyn. *Qapı döyənin Firidun olduğuna inanan Gülnaz onun sözlərini eşitmədi.* M.İbrahimov. *Bu sözdən sonra Nisə xala inandı.* Mir Cəlal. ☐ **İnanmağı gəlməmək** – bir şeyin doğruluğuna, yəqinliyinə şübhə etmək, inana bilməmək. *Hatəmin inanmağı gəlmədi.* Mir Cəlal.

2. Həqiqət bilmək, doğru bilmək, gerçək bilmək. *Adam hər deyilənə inanmaz. Hər cür şayiəyə inanma! Mən onun hər sözünə inanırdım. – Dəhənin dilbərimin çeşməyi-heyvan dedilər; Kim inanır bu sözə, gözgörə böhtan dedilər.* S.Ə.Şirvani. [Süleyman bəy:] *..Təvəqqe edirəm ki, mənə etibar edib sözümə inanasan.* Ü.Hacıbəyov. [İmamver-

di Nurəddinə:] *..İndi get, mən də görüm, nə çarə tapıram, ancaq sərvaxt ol, Əmiraslanın sözünə əsla inanma.* S.S.Axundov.

3. Etibar etmək, bel bağlamaq. *Ona çox da inanmaq olmaz. Xalqa inanmaq lazımdır. Dənizin sakitliyinə inanma.*

4. Ümid etmək, ümidvar olmaq, yəqin etmək, əmin olmaq. *Kəsiləcək yer üzündən, inanıram mən; Müsibətin, fəlakətin ilan nəfəsi.* S.Vurğun.

5. *din.* Etiqad etmək, iman gətirmək. *Dinə inanmaq.* // Mövcud olduğuna qane olmaq. *Taleyə inanmaq. Yuxuya inanmaq.*

6. **İnanmıram** şəklində – şübhə bildirir. *İnanmıram, o, bu gün gələ. İnanmıram, yağış yağsın.*

**İNANMALI** *sif.* İnanılacaq, etibarlı, bel bağlamalı olan, sədaqətli. *O, inanmalı adamdır.* □ **İnanmalı olmaq** – inanmağa, qane olmağa, yəqin etməyə məcbur olmaq. *Keçdiyimiz yerlərdəki vəziyyəti göz önünə gətirib bunlara inanmalı oldum.* M.Rzaquluzadə.

**İNANMAZ** *sif.* Heç bir şeyə inanmayan, inandırıla bilməyən. *İnanmaz adam.*

**İNAYƏT** *is.* [*ər.*] *klas.* Mərhəmət, rəhm, iltifat, şəfqət, yaxşılıq. *Az eyləmə inayətini əhli-dərddən; Yəni ki çox bəlalərə qıl mübtəla məni!* Füzuli. [Mələk:] *Yarəb, azacıq lütfü inayət! Qəhr olmada artıq bəşəriyyət.* H.Cavid. // Səy, qeyrət, cəhd, hümmət. □ **İnayət etmək (qılmaq)** – kömək etmək, qayğı göstərmək, iltifat göstərmək. *Bizə çox kişvər, vilayətlər; Etdilər lütflər, inayətlər.* M.Ə.Sabir. [Kəndli:] *Çox sağ ol, Həsən əmi, böyük inayət elədin.* Ə.Haqverdiyev. [Səlma:] *İnayət qıl, yox başqa bir havadar; Yalnız varım-yoxum tək bir oğlum var.* H.Cavid.

**İNCƏ** *sif.* 1. Zərif işlənmiş, nəfis, qəşəng. *İncə qolbaq. İncə naxış. – Stolun kənarında krovatların yanında kifayət qədər incə sandalyalar düzülmüşdü.* C.Məmmədquluzadə. *Tacirin iddiasına görə, o günə qədər Bağdada bu qədər incə xələt gəlməmişdi.* M.S.Ordubadi. // Nazik, zərif. *İncə barmaqlar. Üzdə incə cizgilər. İncə qaşlar. – Gözəllərin gərək incə belləri; Qənddən, nabatdan şirin dilləri.* Qurbani. *Əcəb qurşanıbdı incə belinə; Gümüş kəmər, qəddi dala yaraşır.* Aşıq Ələsgər. // Çox kiçik, çox xırda, zorla seçilən, fərqləndirilən. *İncə fərq. Sözün incə məna çalarları. İncə təfərrüat.*

2. *məc.* Mehriban, mülayim, həssas, riqqətli. *İncə xasiyyət. İncə ürək. İncə ruh. – Həyatda yaranan hisslərdən ən incəsi, ən kəskini analıq hissidir.* S.Rəhman. *O qanadlı gəncin sadə; Təmiz, incə ruhu vardı.* N.Rəfibəyli.

3. *məc.* Üstüörtülü, pərdəli, tez sezilməyən, gizli. *İncə mətləb. İncə istehza. – Sualın ahəngində incə bir istehza oxunurdu.* M.Hüseyn.

4. *məc.* Ən incəlikləri duyan, qavrayan, dərk edən, dəqiq. *İncə ağıl. İncə zehin.*

**incə-incə** *sif.* və *zərf* Zərif, qəşəng, incə. *İncə-incə çiçəklər. İncə-incə əllər. – İncə-incə yarpağı var; Kölgələrdə bitib açar; Bənövşənin ətir dolu; Dəstəsini kim unudar?* M.Dilbazi. // Kiçik, xırda. *Mirzağa ortaya düşərək incə-incə addımlarla boynunu, çiynini büzüb özünü süzərək oynayır.* S.Hüseyn.

**İNCƏBEL(Lİ)** *sif.* Beli nazik, zərif. *İncəbel qız. – Nigar xanım qabaqda, qırx incəbel qız da dalda dükana tərəf gəlirdi.* "Koroğlu". *Böyük qız ucaboylu, incəbelli .. bir gözəl olduğunu sübut edirdi.* S.S.Axundov. *Bir azdan xurmayı saçlı, incəbel, yaraşıqlı bir qız olan Səriyyə .. gəlib çıxdı.* İ.Əfəndiyev.

**İNCƏDƏN-İNCƏYƏ** *zərf* Bütün təfərrüatı ilə, hərtərəfli, nöqtəsinə qədər. *İncədən-incəyə öyrənmək. – ..Bizim xalq dilini, xalq şerini dərindən duymuşdu, sevmişdi, aşıq şerinin qayda-qanunlarını incədən-incəyə mənimsəmişdi.* M.İbrahimov.

**İNCƏLƏNMƏ** "İncələnmək"dən *f.is.*

**İNCƏLƏNMƏK** b a x **incələşmək**.

**İNCƏLƏŞDİRİLMƏ** "İncələşdirilmək"dən *f.is.*

**İNCƏLƏŞDİRİLMƏK** *məch.* Daha incə, daha zərif edilmək; nazikləşdirilmək.

**İNCƏLƏŞDİRMƏ** "İncələşdirmək"dən *f.is.*

**İNCƏLƏŞDİRMƏK** *f.* Daha incə, daha zərif etmək; nazikləşdirmək.

**İNCƏLƏŞMƏ** "İncələşmək"dən *f.is.*

**İNCƏLƏŞMƏK** *f.* 1. Get-gedə incə olmaq, zərifləşmək. *Qız böyüdükcə incələşirdi.*

*– Mənalı səslərinlə, şerim, incələş; Bir kaman kimi.* M.Müşfiq.

2. Getdikcə nazikləşmək, daralmaq. *Bir neçə gündən sonra Telli balkonda durub getdikcə incələşib gözdən itən ilanvari kənd yoluna baxırdı.* S.Hüseyn.

**İNCƏLƏTDİRMƏ** "İncələtdirmək"dən *f.is.*

**İNCƏLƏTDİRMƏK** b a x **incələtmək**.

**İNCƏLƏTMƏ** "İncələtmək"dən *f.is.*

**İNCƏLƏTMƏK** *icb.* Daha da incə, zərif etmək; naziklətmək.

**İNCƏLİK** *is.* 1. Zəriflik, nəfislik, qəşənglik, gözəllik. *Dərinin incəliyi. Naxışın incəliyi. – Bu sənətdə işlənilən incəlik; Yalnız qadınlara məxsus nemətdir.* A.Şaiq. *Səni kim yaratdı böylə alyanaq; Kiçik yarpağında incəliyə bax!* N.Rəfibəyli. // Naziklik. *Belin incəliyi. Parçanın incəliyi.*

2. Ən xırda təfərrüat, bir şeyin ən spesifik cəhəti və ya cəhətləri (bu mənada çox vaxt cəm şəklində işlənir). *Riyaziyyatın incəlikləri. – Qorki insan qəlbinin incəliklərini böyük həssaslıqla duyub, məharətlə ifadə etməyi bacaran bir sənətkar idi.* R.Rza. *Onlar Teymurun xasiyyətindəki bütün incəliklərə bələd olmuşdular.* H.Seyidbəyli.

3. Riqqət, şəfqət. *Bir şeylər söyləyir, onun sözündə; Könül bir incəlik duyar axşamlar.* Ə.Cavad. *İcazə versəniz danışaram mən; O qız xəyalının incəliyindən.* S.Vurğun.

**İNCƏLMƏ** "İncəlmək"dən *f.is.*

**İNCƏLMƏK** *f.* 1. Arıqlamaq, zəifləmək, üzülmək. *Füzuli zülfünə bağlandı, əmma öndə incəldi; Ki, guya zəf onu həm zülfünə bir tari-mu eylər.* Füzuli. *Jurnal, qəzetə, hərzəvü hədyan oxumaqdan; İncəldi uşağım.* M.Ə.Sabir. // Nazikləşmək, zərifləşmək, daha incə olmaq. *Çəltiklər dirçəlibdir; Sünbüllər incəlibdir; Bu gün qəribə toy var; Bizə gəlin gəlibdir.* (Bayatı). *Elyar oxuduqca incəlir səsi; Məclis sükut edir ona hörmətlə.* S.Vurğun.

2. Kövrəkləşmək, yumşalmaq. [Elxan:] *Ürəyim çocuq kimi incəlmiş; Nəhayət, səni tapdım.* C.Cabbarlı.

**İNCƏLTMƏ** "İncəltmək"dən *f.is*

**İNCƏLTMƏK** *f.* 1. Daha incə bir hala salmaq.

2. Arıqlatmaq, zəiflətmək, üzmək, incəlməsinə səbəb olmaq. *Az qala ki, sənin həsrətin bizi; İncəldibən üzə, qurban olduğum.* M.P.Vaqif. *Ay nazənin, dərdin mənim canımı; Az qalıb incəldə, ay üzə-üzə.* Aşıq Ələsgər. *Eşqə düşənləri axırda bu dərd; Əridər, incəldər, natəvan eylər.* Aşıq Bəyim.

3. Bir şeyi yonub, rəndələyib incə etmək, naziklətmək, nazikləşdirmək. *Taxtanı incəltmək.*

**İNCƏSƏNƏT** *is.* Obyektiv varlığın bədii surətlərdə yaradıcı surətdə əks etdirilməsi, bədii yaradıcılıq fəaliyyəti, gözəl sənətlər, nəfis sənətlər. *İncəsənət əsərləri. XIX əsr incəsənəti. İncəsənət muzeyi. İncəsənət xadimləri. İncəsənət ongünlüyü.* // Bədii yaradıcılıq sahələrindən biri. *Təsviri incəsənət. Kino incəsənətlərin ən kütləvi formasıdır. – Mən bu gün bir daha qadının incəsənət işlərində kişilərdən daha yüksəkdə durduğunu gözümlə gördüm.* M.S.Ordubadi.

**İNCƏVARA** *ara s. məh.* Yaxşı ki, xoşbəxtlikdən. *Dedim ki, pristava xəbər verəcək, .. incəvara, olmadı.* S.Rəhimov. *Bu hiyləgər hərif, incəvara, köhnə adamları aldada bilirdi..* E.Sultanov.

**İNCİ** *is.* 1. Bəzi molyuskların balıq-qulaqlarından çıxarılan ağ və ya çəhrayı (nadir hallarda qara) rəngli dənələr şəklində qiymətli sədəf maddəsi; mirvari, dürr. // Həmin maddədən hazırlanan qiymətli qadın bəzəyi (muncuq). *Nə göyçək yaraşır, nə xoş görünür; Mina, inci kəmər bel arasında.* Q.Zakir. [Qətibə] *baş örtüsünün qarşısına almaz, yaqut və incilərdən düzülmüş bir cıqqa taxmışdı.* M.S.Ordubadi. *Ləpələrin qucağında dolaşdım axşam-səhər; Gözlərimi qamaşdırdı dibindəki incilər.* B.Vahabzadə.

2. *məc.* Çox qiymətli şey haqqında. *Yığır öz əliylə torpaq altından; Yerdə gizlədilmiş o inciləri.* S.Vurğun.

3. *məc.* Təşbehlərdə: saflıq, təmizlik parlaqlıq mənasında. *İnci tər. – Sıçrayarkən işıldayar damcılar; San saçılar mirvaridlər, incilər.* A.Səhhət. *Yenə ay işığında qumlar sanki incidir.* N.Rəfibəyli. *..Məxmər otların arasından büllur sular süzülür, qönçələrə, düyməçələrə parlaq incilər düzülürdü.* M.Rzaquluzadə. // Eyni mənada dişlər haq-

qında. *Dəhanın sədəfdir, dişlərin inci; Sanasan ağzın püstədir, ay qız!* M.P.Vaqif. *Bir xoş yerişlinin, inci dişlinin; İncə baxışlının, tər qumaşlının; Bir allı, güllünün dağı məndədir.* Aşıq Rəcəb. *Rozanın dodaqları qaçdı, qaranlıqda onun ağ, inci dişləri parıldadı.* S.Rəhimov.

◊ **İnci kimi (təki)** – kiçik, təmiz və düzgün. *Aygün oxuduqca nəzər saldı ki; İncitək düzülmüş sözlər yanaşı.* S.Vurğun. *..Çobanın təkcə gözləri, bir də inci kimi düzülmüş saf dişləri ağarırdı.* İ.Hüseynov.

**İNCİBALIĞI** *is. zool.* Sazan fəsiləsindən pullu kiçik balıq.

**İNCİÇİÇƏYİ** *is. bot.* Xırda ağ çiçəkləri olan ətirli çoxillik bitki (dərman bitkisi kimi istifadə olunur).

**İNCİDİLMƏ** "İncidilmək"dən *f.is.*

**İNCİDİLMƏK** *məch.* 1. Əziyyət verilmək, əzab verilmək.

2. Küsdürülmək, ürəyi sındırılmaq. [Aqil] *Gülnazın kimin tərəfindən isə incidildiyini güman edib dalınca yüyürdü.* Q.İlkin.

**İNCİK** *sif.* İncimiş, küsmüş, rəncidə, ürəyi sınmış. *İncik baxış. İncik sual. – Tükəz qarı incik səsini ucaltdı.* S.Rəhimov. // Zərf mənasında. *Şirzad Pərşanın belə incik ayrılıb getməsindən qorxdu.* M.İbrahimov. [Maral və Kəyan] *incik ayrılmışdılar.* Ə.Əbülhəsən. *Şahpərinin son ümidi də puça çıxdı. O, incik halda dilləndi.* B.Bayramov. ☐ **İncik olmaq** – incimək, küsmək, könlü sınmaq. *Əzizim, gülşən olmaz; Bir güllə gülşən olmaz; Dost dostdan incik olsa; İnciyər, düşmən olmaz.* (Bayatı). [Teymur ağa:] *..Xub, mən vəzirə nə eləmişəm ki, məndən incik olubdur?* M.F.Axundzadə. **İncik salmaq** – incitmək, küsdürmək, qəlbini qırmaq.

**İNCİKLİ** b a x **incik**. *Zinhar, şikayət etmə məndən; İncikli hekayət etmə məndən!* Füzuli.

**İNCİKLİK** *is.* İncimə, küsü, aradəymə, küsüşmə, narazılıq. [Dəlilər] *yedilər, içdilər, keflər kökəldi, damağlar cağ oldu, inciklik yaddan çıxdı.* "Koroğlu". *Mirzə Süleyman atasını çox sevirdi və sağ olan vaxtında nə qədər inciklik vardısa, indi hamısını əfv edərdi..* B.Talıblı. *Səttarzadə ailədə söz-sov, ovqattəlxlik görmüşdü, hətta bərk inciklik də xatırlayırdı.* Mir Cəlal. ☐ **Araya inciklik salmaq** – bir-birindən incitmək, küsüşdürmək, narazılıq salmaq. [Hacı Murad:] *Onlar istəyir ki, ata-oğul arasına inciklik salıb nəfbərdar olsunlar.* S.S.Axundov. **İnciklik düşmək, araya inciklik düşmək** – bir-birindən incimək, narazılıq düşmək. [Salman:] *Yoxsa neçə ilin ayrılığından sonra istəyirsən, aramıza inciklik düşsün?* Ə.Haqverdiyev. // İnciməyə səbəb olan hal, iş. [Vəzir:] *Bu gün mənə hər tərəfdən inciklik üz verir.* M.F.Axundzadə.

**İNCİL** *is.* [*ər.*] Bibliyanın, İsanın həyat və təlimi haqqındakı əfsanələrdən bəhs eləyən və xristian dininin əsasını təşkil edən hissəsi. *Bu əməl harda yazılıb? İncilə, Qurana baxın!* Aşıq Ələsgər. [Dərviş Şeyx Sənana:] *Əvət, Quran, Zəbur, İncilü Tövrat; Birər röya ki, zor təfsiri, heyhat!* H.Cavid.

**İNCİLMƏK** b a x **incəlmək**. *Əzizim, ay incilər; Yox sizə tay, incilər; Sənə baxan gözlərim; Günü-gündən incilər.* (Bayatı).

**İNCİMƏ** "İncimək"dən *f.is.*

**İNCİMƏK** *f.* 1. Əziyyət çəkmək, ağrı hiss etmək. *Eşqin yolunda qəm verə üz, aşiq incməz.* S.Ə.Şirvani. [Şeyx Səlim] *..varlığını hiss etmirdi, çünki ona daş dəydikdə belə, deyəsən, incimir və qırçınmırdı.* M.S.Ordubadi. *İncimiş, yorulmuş Gülara artıq harayının heç bir yerə çatmayacağını görüb ala gözlərindən yaş ələməyə başladı.* Ə.Vəliyev.

2. Küsmək, qəlbi qırılmaq, sınmaq. *Neyləmişəm inciyibsən; Yenə, ey gülbədən, məndən?* Q.Zakir. [Hacı Əhməd Almaza:] *Ancaq bacıqızı, uzun sözün qısası, biz səndən incimişik.* C.Cabbarlı. *..Həmyerlisi* [Səməddən] *qonaqlıq vermədiyinə görə incimədi.* İ.Hüseynov.

**İNCİNAR** [*rus.* injener sözünün canlı dildə təhrif edilmiş forması] b a x **mühəndis**. *İncinar oldu Qasım bəy, bizə çox verdi əzab; Həq evin yıxsın onun, etdi bizi xanəxərab.* S.Ə.Şirvani. [Sultan bəy:] *Yoxsa bu incinar-mincinar, doxtur-moxtur, vəkil-məkil, uçitel-muçitellərlə mənim işim olmaz.* Ü.Hacıbəyov. [İmran:] [Suğra] *qoy gedib incinardan, ağranomdan olsun.* M.Hüseyn.

**İNCİNARLIQ** ["injener" sözündən] b a x **mühəndislik**. *İncinarlıq özü bir elmdi, bihəddü hesab.* S.Ə.Şirvani.

**İNCİNMƏK** *klas.* bax **incimək**. *Gerçək möhübbə cövrü cəfa çünki yar edər; Neyçün cəfadan incinə, qəmdən məlul ola.* Nəsimi. *İncinmə ki, səndən oldu təqsir.* Məsihi. *Məndən incinibdir ol üzü alım; Heç bilmənəm könlün ta nə ilə alım.* Aşıq Maqsud.

**İNCİŞMƏ** "İncişmək"dən *f.is.*

**İNCİŞMƏK** *qarş.* Bir-birindən incimək, küsüşmək, araları dəymək.

**İNCİTMƏ** "İncitmək"dən *f.is.*

**İNCİTMƏK** *f.* 1. Əziyyət vermək, əzab vermək, işgəncə etmək. *Nəbi özündən sonra Mehdini incidəcəklərini düşünür.* "Qaçaq Nəbi". // Yormaq, əldən salmaq, üzmək. *Koroğlu iltimas eylər; Bala, incitmə Qıratı!* "Koroğlu".

2. Ağrıtmaq, əziyyət vermək. [Harun:] *İncidir yaralarım, yoxdur ümidim özümə.* Ü.Hacıbəyov. *..Ayaqlarım yalın olduğuna görə yolun quru kəsəkləri məni incitdi və mən də üst tərəfdə tapdalanmamış bir cığıra düşdüm.* A.Divanbəyoğlu.

3. Narahat etmək, narahatlığına səbəb olmaq. *Bundan savayı, Bahadırı incidən o oldu ki, vaxtında gedib Tiflisə çatmayacaqdır.* N.Nərimanov. *Hava sakit olduğundan təyyarəmiz süzüb gedir, heç kəsi incitmirdi.* M.İbrahimov. [Körpənin] *ağlaması da Gülaranı darıxdırır, incidirdi.* Ə.Vəliyev.

4. Küsdürmək, xatirini qırmaq, qəlbinə toxunmaq, narazı salmaq. *Şəkilləri çəkmək cəhətindən min doqquz yüz doxsan doqquz mollanı özümüzdən incitmişik.* C.Məmmədquluzadə. *Fəqət səni burada yalnız bir kəlmə ilə incidəcəyəm..* H.Nəzərli. *Osa ömrü boyunca incitmədi bir kəsi.* B.Vahabzadə.

**İNDÉKS** [*lat.*] 1. Bir şeyin adları yazılmış siyahısı; adlar siyahısı. *Çıxmış kitabların indeksi. Malların indeksi.*

2. *iqt.* Hər hansı bir iqtisadi hadisənin ardıcıl dəyişmələrini faizlə ifadə edən rəqəm göstəricisi. *Əmək məhsuldarlığı indeksi. Əmək haqqı indeksi. Qiymət indeksi.*

3. *riyaz.* Riyazi ifadəyə daxil olan hərfin sağ tərəfində (adətən altında) yazılan rəqəm və ya hərf; məs.: $A_2$, $X_p$.

4. *xüs.* Kitabxana təsnifində: kitab qisimlərini göstərən, adətən rəqəmlər və ya hərflər şəklində olan şərti işarə.

**İNDEKSLİ** *sif.* İndeksi olan.

**İNDETERMİNÍST** [*lat.*] *fəls.* İndeterminizm tərəfdarı.

**İNDETERMİNÍZM** [*lat.*] *fəls.* Təbiət və cəmiyyətdə baş verən hadisələrin qanunauyğunluğunu və səbəbiyyətini inkar, insan iradəsinin mütləq "azadlığını", yəni onun heç bir şeydən asılı olmadığını iddia edən idealist görüş.

**İNDƏN**: **indən belə, indən sonra** – bu andan etibarən, bundan sonra. *İndən belə ayıq ol! – Yolun çox gözlədim, axır gəlmədin; Yoxdur indən belə etibar sənə.* Aşıq Pəri. // Daha, artıq. *Yetişibsən, indən belə yaraşmaz; Yadlar ilə deyib-danışmaq sənə.* Q.Zakir.

**İNDİ** *zərf* 1. Hazırda, bu anda, hazırkı vaxtda, bu saat, əlan. *İndi gəldi. İndi gedəcəyəm. Görəsən, indi o haradadır? – Dağlar, sənin ilə həmdəm olmadım; Əsirgərsən indi qarı da məndən.* Qurbani. *Dedi xatun ki: – Söylə, ey fərzənd; Noldu kim, olduq indi dövlətmənd?* M.Ə.Sabir. // Bu saat, tez. *Sel axar, mələr gələr; Dağ-daşı dələr gələr; Düşmən gəldi, indi gör; Başıma nələr gələr.* (Bayatı). [Əsgər Gülçöhrəyə:] *..İndi sən get evə, yoxsa bizi görərlər, xudahafiz.* Ü.Hacıbəyov. *İndi nazirlər qarşı-qarşıya oturmuşdu.* S.Hüseyn. // Əvvəlki vəziyyətə, şəraitə, keyfiyyətə qarşılıq mənasında. *İndi mən o adam deyiləm. İndi o çox ağıllanmışdır. İndi adam lazımdır ki, bu işi boynuna götürsün.*

2. Başqa mətləbə, mövzuya, məsələyə keçdikdə işlənir. *İndi o biri söhbətə keçək. İndi mən sizi yeni əsərlərlə tanış edəcəyəm.*

◊ **İndi də** – 1) hələ də. [Səmirə:] *Bu zəifliyim üçün indi də özümü danlayıram.* M.Hüseyn; 2) indi, bu dəfə. *İndi də onun sözlərində elə bir məna görməyən qızlar cavab qaytarmadılar.* İ.Hüseynov. **İndi ki** – bir halda ki, madam ki, əgər. *İndi ki sən gedirsən, mən getmirəm.* – [Yaşlı kişi:] *İndi ki sən sözündə israr edirsən, get, özünü imamın qəbrinə bağlayıb, Çopur üçün ağla, – dedim.* S.Hüseyn. [Gülçöhrə:] *Ay ata, indi ki sən istəyirsən mən ərə gedim, qoy onda öz istədiyimə gedim.* Ü.Hacıbəyov.

**indi-indi** *zərf* Yenicə, təzəcə, lap bu saat. *Tamaşaçılar indi-indi zala yığılmağa*

*başlamışlar. – Məryəm indi-indi oxumuş, irəliləmiş bir cəmiyyət qızı idi.* C.Cabbarlı. *Camaat indi-indi dağdan-daşdan qayıdır.* Ə.Məmmədxanlı. *İndi-indi atasının təklifi* .. [Rübabəni] *odlandırır, təhqir edirdi.* Mir Cəlal.

**İNDİCƏ** *zərf* Bu saat, bu dəqiqə, bu anda. *İndicə getdi. İndicə gələr. İndicə yola saldım.* – [Cəlal:] *Yox, canım, – dedi, – kişinin babalın yumayın. İndicə küçədə rast gəldik.* Çəmənzəminli. *Biçarə muzdurun damarları qurudu ki, indicə yaranalın buyuruğu ilə Həsənəli bəy onu tutub qazamata göndərəcəkdir.* S.M.Qənizadə. *Günün şöləsindən parladıqca qar; Deyirsən: – İndicə əriyəcəkdir.* H.Arif.

**indicə-indicə** *zərf* İndi-indi, təzə-təzə, təzəcə, yenicə. *Atovun goru üçün, boşla bu tifli başına; İndicə-indicə ancaq yetir on bir yaşına.* M.Ə.Sabir.

**İNDİDƏN** *zərf* 1. Bu vaxtdan, bu andan, bu gündən, bu dəqiqədən, qabaqcadan. *İndidən hazırlıq görmək lazımdır. – Rüstəm kişi elə indidən müavini itaətdə saxlamağı qərara aldı.* M.İbrahimov. // Fürsət varkən, imkan varkən, nə qədər ki gec deyil. *Hər kəs dünyanın təqazasına bir az bələddirsə, indidən gərək yəqin eliyə ki, Ordubad cəhaləti Əylis mədəniyyətinin qabağında dayana bilməz.* C.Məmmədquluzadə.

2. Tezdən, ertədən, vaxtından əvvəl. *İndidən niyə gəlmisən?*

**İNDİFERÉNT** *sif.* [*lat.*] 1. Qeyri-müəyyən, laqeyd, etinasız.

2. Boş, əhəmiyyətsiz.

3. *fiz.* Neytral.

**İNDİKÁTOR** [*lat.*] 1. *tex.* Fiziki kəmiyyətləri (təzyiqi, yükü və i.a.) təyin etmək üçün işlədilən bir sıra cihazların adı. *Elektrik ehtizazları indikatoru.*

2. Kimyəvi reaksiyanın sonunu (rəngin dəyişməsi, çöküntü və s. üzrə) bildirən maddə (reaktiv). *Reaksiyaların sonunu bildirmək üçün əlavə edilən maddəyə indikator* (*yəni göstərici*) *deyilir.* H.Şahtaxtinski.

**İNDİKİ** *sif.* Hazırkı, hazırda mövcud olan, hazırkı zamana aid olan; müasir. *İndiki insanlar. İndiki dövr. İndiki ədəbiyyat. İndiki şərait.* // Budəfəki. *Cəbi həmişə anasına baxırdı, fəqət indiki baxışda bir atəş, bir elektrik qüvvəsi var idi.* N.Nərimanov. *Heç zaman qəm-qüssə indiki qədər ürəyimi sıxmamışdı.* İ.Əfəndiyev.

**İNDÍQO** [*isp.*] 1. Kimyəvi üsulla əldə edilən tünd-sürməyi boya maddəsi (keçmişdə bitkilərin şirəsindən hasil edilirdi).

2. *dan.* Tünd-sürməyi yun parça. *Katibin .. indiqodan tikdirdiyi üst köynəyi çəkilib, dal tərəfdən bir yerə yığıldığı üçün, enli toqqanın sarı dəmiri üzərindəki beşguşə ulduz açıq görünürdü.* Ə.Vəliyev.

**İNDİLİK** *zərf* 1. Hələlik, indiki halda, indiki vaxt üçün, hazırkı zamana görə. *İndilik bu bəsdir. – İndilik hamı lazım deyil. Bir-iki nəfər öhdəsinə götürsə kifayətdir..* T.Ş.Simurq. *İndilik bu danışıqları buraxsaq yaxşıdır.* H.Nəzərli. *İndilik tikintidə günəmuzd işləmək olar.* Mir Cəlal.

2. *İs. mənasında.* İndiki hal, hazırkı vəziyyət. [Kərim baba:] [Qızıl itin] *bir qardaş qədər mənə yaxşılığı keçmişdir. Sən bunun indiliyini görürsən.* A.Şaiq.

**İNDİLİKDƏ** *zərf* İndiki vaxtda, indiki şəraitdə, hələlikdə, hal-hazırda, hələlik. *Möhtərəm "Rəhbər"in bu təvəqqeini biz indilikdə əmələ gətirə bilmərik..* C.Məmmədquluzadə. [İsmayıl:] *..İndilikdə klubun müdirliyini Yusif yoldaşa tapşırırıq.* Mir Cəlal.

**İNDİYƏDƏK, İNDİYƏCƏN** *zərf* Bu ana qədər, bu vaxta qədər, bu günə kimi. *..Keçən il Bakıda yığılan qırx beş min manatdan indiyədək bircə nəfər müsəlman acının qarnı doymayıb.* C.Məmmədquluzadə. *Gülbadam uşaqlıqdan indiyədək tamam başından keçəni göz qabağına gətirib, indi əri Məşədi Allahverənin yuxusuna öz yanında gülərdi.* N.Nərimanov. *İndiyəcən göydən gurultudan başqa bir kəsə bir cavab gəlməmişdi ki, Münəvvərə də gələ idi.* Mir Cəlal.

**İNDONEZİYALI** *is.* İndoneziya əhli, malay xalqına mənsub adam.

**İNDUÍZM** [*sanskr.*] Hindistanda: eramızın V əsrində brəhmənizm və buddizm əsasında təşəkkül tapmış hakim din.

**İNDÚKSİYA** [*lat.*] 1. *mənt.* Ayrı-ayrı, xüsusi təsadüflərdən ümumi nəticələr çıxarma üsulu.

2. *fiz.* Maqnit sahəsinin təsiri ilə və ya yüklü elektrik cisminin yaxınlaşması ilə hər

hansı bir keçiricidə elektrik və maqnit enerjisinin əmələ gəlməsi.

3. *fiziol.* Sinir sistemində oyanma ilə ləngimə (tormozlama) prosesləri arasındakı əlaqə, birinin digərindən asılı olaraq meydana gəlməsi prosesi.

**İNDUKSİYALANMA** "İnduksiyalanmaq"-dan *f.is.*

**İNDUKSİYALANMAQ** *f. xüs.* İnduksiyaya çevrilmək, induksiya əmələ gəlmək.

**İNÉRSİYA** [*lat.*] *fiz.* Düz xətt üzrə hərəkətdə olan cismin öz müntəzəm hərəkətini, sükunətdə olan cismin isə öz sükunətini xarici bir qüvvə müdaxilə etmədikcə mühafizə etmə xassəsi; ətalət. *İnersiya qüvvəsi.*

**İNƏK** *is.* 1. Süd verən iri ev heyvanı, öküzün dişisi. *Südlü inək. Qısır inək. İnək qatığı, qaymağı* (inək südündən hazırlanan qatıq, qaymaq). – *Rəna dərhal qollarını çırmayıb inəyi sağmaq üçün getdi.* M.S.Ordubadi. ..*Evin sağındakı qocaman qoz ağacı yanında inək mələdi.* M.Hüseyn.

2. *vulq.* Çox kök, yöndəmsiz qadın, yaxud qorxaq və ya küt adam haqqında.

◊ **İnək kimi sağmaq** – özü üçün gəlir mənbəyi etmək, müntəzəm surətdə birinin pulunu, varını əlindən almaq, sorub çəkmək, istismar etmək. *Bir sözlə, Molla Qasım Güllücə kəndini inək kimi sağıb yeyirdi.* S.S.Axundov. // İstismar etmək. *Hər il inək kimi sağılan torpaq gücdən düşmüşdü.* (Qəzetlərdən).

**İNƏKÇİ** *is.* İnək saxlayan; inəyəbaxan.

**İNƏKÇİLİK** *is.* İnək yetişdirib saxlama. *İnəkçiliyi inkişaf etdirmək.*

**İNƏKƏMCƏYİ** *is.* İri, uzunsov, qırmızıya çalar gilələri olan üzüm növü.

**İNƏKLİ** *sif.* İnəyi olan. *Qonşunu iki inəkli istə ki, özün də bir inəkli olasan.* (Ata. sözü).

**İNƏKNOXUDU** *is. bot.* Paxlalılar fəsiləsindən birillik və ya çoxillik ot bitkisi (yem bitkisi kimi istifadə olunur).

**İNƏKOTARAN** b a x **naxırçı**.

**İNƏKOTU** *is. bot.* Xalq təbabətində istifadə edilən çoxillik bitki. *İnəkotu çoxillik bitki olub, təxminən bir metr hündürlüyündə qol-budaqlı gövdəyə malikdir. Laləyə oxşar çılpaq, tünd-yaşıl və böyük yarpaqları uzun saplaqlar üzərində yerləşmişdir.* R.Əliyev.

**İNƏKSAĞAN** *sif.* İnəkləri sağan və onlara qulluq edən işçi; sağıcı.

**İNƏKSİZ** *sif.* İnəyi olmayan, inək saxlamayan. *İnəksiz kəndlilər.*

**İNƏYƏBAXAN** b a x **inəkçi**.

**İNFÁRKT** [*lat.*] *tib.* Spazma və ya başqa səbəblər üzündən damarlarda qan cərəyanının kəsilməsi nəticəsində bədənin hər hansı bir üzvünün toxumalarında əmələ gələn ölgünlük. *İnfarkt olmaq. Ürək damarları infarktı.*

**İNFEKSİÓN** *sif.* [*lat.*] İnfeksiyanın törətdiyi, yoluxucu. *İnfeksion xəstəliklər.*

**İNFÉKSİYA** [*lat.*] *tib.* Yoluxucu xəstəlik törədən mikroorqanizmin orqanizmə girməsi, yoluxma; mikrob.

**İNFİNİTÍV** [*lat.*] b a x **məsdər**.

**İNFLYÁSİYA** [*lat.*] *iqt.* Kağız pulların əmtəə tədavülü tələbindən artıq buraxılması nəticəsində qiymətdən düşməsi.

**İNFORMÁSİYA** *is.* [*lat.*] 1. Məlumatlar məcmusu.

2. İnformasiya anlayışlarından biri.

**İNFRAQIRMIZI** [*lat.* infra və qırmızı]: **infraqırmızı şüalar** *fiz.* – spektrin görünən qırmızı kənarından daha uzağa yayılan gözlə görünməyən hissəsi. *Raketdə .. Yerin və Yer atmosferinin infraqırmızı şüalarını müəyyən etmək üçün cihazlar qoyulmuşdur.* (Qəzetlərdən).

**İNFRASƏS** [*lat.* infra və səs] *fiz.* Havada və başqa mühitdə olub, insan qulağının qavraya bilmədiyi alçaq tezlikli titrəyişlər.

**İNGİLİS** *is.* İngiltərənin əsas əhalisini təşkil edən, Hind-Avropa dillərindən birində danışan xalq və bu xalqa mənsub adam.

**İNGİLİSCƏ** 1. *sif.* və *zərf* İngilis dilində. *İngiliscə kitab. İngiliscə danışır. İngiliscə-azərbaycanca lüğət.*

2. *is.* İngilis dili. *İngiliscəni yaxşı bilir.*

**İNGİLİSPƏRƏST** *is.* İngilis millətini, onun mədəniyyətini, adət və üsullarını sevən adam; İngiltərəyə və ingilislərə hüsnrəğbət bəsləyən adam.

**İNGİLİSPƏRƏSTLİK** *is.* İngiltərəyə, ingilis millətinə, onun mədəniyyət və adətlərinə pərəstiş etmə; ingilis pərəstişkarlığı.

**İNHALYÁSİYA** [*lat.*] *tib.* Buxar, qaz və ya toz halına salınmış dərman maddələri ilə

nəfəs alma vasitəsilə yuxarı nəfəs yollarının müalicəsi. *Təbabətdə ətirli yağlardan müxtəlif məqsədlər üçün istifadə edilir. Bunların bəzisi boğaz-burun xəstəliklərində inhalyasiya məqsədi ilə işlədilir.* R.Əliyev.

**İNHALYÁTOR** [*lat.*] *tib.* 1. İnhalyasiya cihazı.

2. İnhalyasiya otağı.

**İNHALYATÓRİ** [*lat.*] *tib.* İnhalyasiya otağı; inhalyasiya üçün xüsusi yer.

**İNHİLAL** *is.* [*ər.*] *köhn.* 1. Açılma (düyün).

2. Dağılma, bir-birindən ayrılma.

**İNHİRAF** *is.* [*ər.*] 1. *klas.* Dönmə, sapma, kənara qaçma, başqa tərəfə meyiletmə, qaçma. *Gər doğru isə vəfadə lafın; Məndən nə üçündür inhirafın?* Füzuli.

2. *xüs.* Bir tərəfə meyil, istiqamətini dəyişmə, meyillənmə. *Maqnit əqrəbinin inhirafı. Milin inhirafı. – Ağırlıq mərkəzindən asılmış bir maqnit əqrəbi götürsək, əqrəb bir qədər titrədikdən sonra maqnit meridianı müstəvisində yerləşəcək və eyni zamanda üfüqi səth ilə bucaq təşkil edəcəkdir. Buna maqnit inhirafı və ya sadəcə olaraq inhiraf deyilir.* "Ümumi fiziki coğrafiya".

**İNHİSAR** *is.* [*ər.*] *iqt.* 1. Bir malı istehsal etmək və ya satmaq, yaxud ondan istifadə etmək hüququnun bir şəxsə, müəssisəyə, dövlətə məxsus olması; monopoliya. *Xarici ticarət inhisarı. Neft inhisarı. Dövlət inhisarı.*

2. İqtisadiyyatın hər hansı bir sahəsində hakim mövqeləri tutmaq və ən çox qazanc əldə etmək məqsədi ilə kapitalın təmərküzləşdirilməsi əsasında yaradılan iri kapitalist birləşməsi; monopoliya. *İnhisar birləşmələri.*

**İNHİSARÇI** 1. *sif.* Təsərrüfatın hər hansı bir sahəsində inhisar hüququndan istifadə edən. *İnhisarçı şirkətlər. İnhisarçı trestlər.*

2. *is.* İnhisarçı kapital nümayəndəsi olan iri kapitalist.

**İNHİTAT** *is.* [*ər.*] *kit.* 1. Düşmə, aşağı enmə, alçalma.

2. Geri getmə, tənəzzül, düşkünlük. *Bir müəyyən qanun üzrədir həyat; Bir doğuş, bir təkamül, bir inhitat.* A.Səhhət. *Ənisə islam mədəniyyətinin inhitatı səbəblərini araşdırıb izah edirdi.* S.Hüseyn.

**İNİKAS** *is.* [*ər.*] 1. Bir yerə dəyib geri qayıtma, əksetmə; surətin şüşəyə, suya və ya başqa parlaq bir şeyə dəyib orada əks olunması. *Ayın dənizdə inikası.* // Səsin dağa, qayaya və ya başqa bir maneəyə çarpıb oradan çıxmış kimi geri qayıtması. *Səsin inikası.* □ **İnikas etdirmək** – əks etdirmək, göstərmək. **İnikas etmək** – əks etmək.

2. *fəls.* Xarici aləmin surətlər şəklində xəyalımızda canlanması.

**İNİLDƏMƏ** "İnildəmək"dən *f.is.*

**İNİLDƏMƏK** *f.* 1. Bərk ağrı, əziyyət, ruhi iztirab və s. nəticəsində yavaşca, ağlar kimi həzin səs çıxarmaq; zarımaq, sızıldamaq. *Yaralı inildəyir. – Yatır, inildəyir, durub boylanır; Bir neçə yerindən yaralı gördüm.* Aşıq Ələsgər. *Bir əllərimi al-qırmızı boyayan qana, bir də otlar üstündə inildəyə-inildəyə* (z.) *sürünən o kiçik heyvana baxdım.* A.Şaiq.

2. *məc.* Məruz qaldığı bir hadisənin və ya vəziyyətin ağırlığından sızıldayıb şikayətlənmək; ruhdan düşmək, bədbinlik göstərmək. *..Rüstəm həmişə əllərinə güvənmiş və inildəməmişdi.* S.Rəhimov.

3. *məc.* Həzin, yanıqlı musiqi, nəğmə səsi haqqında; ümumiyyətlə, insanda hüzn və kədər oyadan səs haqqında. *Kaman inildəyir.* // Yazıq-yazıq mələmək. *Dağda maral xoş mələr; Xoş inildər, xoş mələr; Sənsiz bir ah çəkərəm; Dağ inildər, daş mələr.* (Bayatı). [Dərviş:] *Könlüm yaralı maral kimi inildəyirdi.* A.Divanbəyoğlu.

**İNİLDƏŞMƏ** "İnildəşmək"dən *f.is.*

**İNİLDƏŞMƏK** *qarş.* İnildəmək, inilti səsi çıxarmaq, yazıq-yazıq mələmək (çoxları haqqında). *Qoyunlar da toplaşıb inildəşdi, mələşdi, sanki əlibıçaqlı qəssabı görüb ağlaşdı.* S.Rəhimov.

**İNİLDƏTMƏ** "İnildətmək"dən *f.is.*

**İNİLDƏTMƏK** *icb.* İnildəməsinə səbəb olmaq, zarıtmaq. // Çox əziyyət vermək.

**İNİLTİ** *is.* İnləmə səsi, həzin, yanıqlı səs; zarıltı, sızıltı. *Çinarlıqda yalnız başıma gəzdim; Bu halda incə bir inilti sezdim.* H.Cavid. *Qulaqlarımda Qonçanın iniltiləri, çığırtıları, yalvarışları eşidilirdi.* S.Hüseyn. *Bu ağlayış və inilti səslərindən çəkilən sədlər onları saxlamağa qadir deyildir.* Ə.Məmmədxanlı. // *məc.* Ümumiyyətlə, təsirli, yanıqlı, həzin, şikayətli səs. *Bülbülün səsi də*

*anasını körpəlikdə itirmiş bir uşağın iniltisi qədər qəmgin və kədərlidir.* M.S.Ordubadi. *Uşaqların bağırtısı, qızların, gəlinlərin çalğısı, yastıbalabanların həzin iniltisi bir-birinə qarışmışdı.* C.Cabbarlı. *Oradan-buradan gecəquşularının iniltiyə bənzər ulamaları eşidilirdi.* M.Rzaquluzadə.

**İNİLTİLİ** *sif.* İnilti ilə dolu, şikayətli. *Nəhayət, nənəsinin ardı-arası kəsilməyən iniltili çağırışı Cəmili yuxudan ayıltdı.* S.Rəhimov.

**İNİR-İNİR: inir-inir inləmək** – inilti səsi çıxarmaq, inildəmək. *..Ağaclar inir-inir inləyir, külək qarşısında ta kötüklərinə qədər əyilir, doğrulurdu.* A.Şaiq.

**İNİŞİL** *zərf* Keçən ildən qabaqkı il. *İnişil Aşqabada getmişdim. İnişil yayı kənddə keçirmişdik.* – [Qərənfil:] *İnişil təşəbbüs qaldırdınız ki, hamam tikək, hələ hörgüsü bir arşın qalxmayıb.* İ.Əfəndiyev. [Minayə:] *İnişil biz hər qutudan iyirmi səkkiz kilo barama verməliydik.* İ.Hüseynov.

**İNİŞİLKİ** *sif.* Keçən ildən qabaqkı il olan, inişil baş vermiş. *İnişilki hadisə.* – *Xüsusən inişilki dağ köçü bütün təfərrüatı ilə* [Laçının] *xəyalında canlandı.* M.Hüseyn.

**İNJEKTOR** *is.* [*fr.*] Su vurmaq üçün şırnaqlı nasos.

**İNJENÉR** [*fr.*] b a x **mühəndis**.

**İNJENERLİK** b a x **mühəndislik**.

**İNKAR** *is.* [*ər.*] Tanımama, rədd etmə, qəbul və təsdiq etməmə, danma. *İkidir gərçi pəriçöhrələrin güftarı; Bir imiş bunların iqrarı ilə inkarı.* Qövsi. ◻ **İnkar etmək (eləmək, qılmaq)** – bir şeyin varlığını, doğruluğunu və s.-ni qəbul və təsdiq etməmək, rədd etmək, danmaq. *Nainsaf köhnəpərəstlər mədəniyyətin və maarifin mənfəətlərini inkar edirlər.* C.Məmmədquluzadə. *Sən olmasan verməzdim mən eşqə bir məna; Bu yolda sən mana rəhbərsən, eyləməm inkar.* H.Cavid. *Güldəstə Güldəstə olduğunu bir daha inkar elədi.* H.Seyidbəyli. // *hüq.* Özünə qarşı irəli sürülən və isnad edilən bir şeyi qəbul etməyib rədd etmək, danmaq. *Günahını inkar etmək.*

◊ **İnkarı inkar** *fəls.* – təbiətin, cəmiyyətin və təfəkkürün dialektik inkişafı prosesində yeninin törənməsi ilə tarixi ardıcıllıq arasındakı vəhdəti ifadə edən əsas qanunlardan biri.

**İNKAREDİCİ** *sif.* İnkar edən, rədd edən, danan, qəbul və təsdiq etməyən. *İnkaredici dəlillər.* – *"Molla Nəsrəddin" realizmi və satirası yenə də öz inkaredici, ifşaedici xüsusiyyətlərini saxlayır.* M.İbrahimov.

**İNKAREDİLMƏZ** *sif.* İnkar edilə bilməyən, rədd edilə bilməyən, inandırıcı, şəksiz. *İnkaredilməz həqiqət. İnkaredilməz fakt.*

**İNKAREDİLMƏZLİK** *is.* İnkar edilə bilməmə, inandırıcılıq, şəksizlik. *Faktların inkaredilməzliyi.*

**İNKASSÁTOR** [*ital.*] Əsasən idarə, müəssisə xaricində kassalarda toplanmış pulu sənədlər üzrə qəbul etməklə və pul verməklə məşğul olan kassir. [Cinayətkarlar] *həmin əmanət kassasından pul aparmağa gələn inkassatoru oğurlamışdılar.* H.Seyidbəyli.

**İNKASSATORLUQ** *is.* İnkassatorun işi, vəzifəsi. *İnkassatorluq etmək.*

**İNKİR-MİNKİR** *is.* [*ər.*] Dini etiqadlara görə, qəbirdə ölünü sorğu-sual edən iki mələk. *Çox zaman qurduğum cələdəki quşlar yerinə gözlərimə anamın dəhşətli təsvir etdiyi, əllərində odlu kösövlər olan inkir-minkir görünürdü.* M.İbrahimov. [Beşaçılanlı adam:] *Vaxtı keçirməyin, inkir-minkir özü soruşacaq.* Mir Cəlal.

**İNKİSAR** *is.* [*ər.*] 1. Qırılma, sınma. // *fiz. köhn.* İşıq şüalarının şəffaf bir şeyin içindən keçərkən sınması, istiqamətini dəyişməsi.

2. *məc.* Qəlbi qırılma, ürəyi sınma, incimə, xatirinə dəymə.

◊ **İnkisari-xatir (qəlb)** – könlü sınma (qırılma), ürəyi sınma. **İnkisari-xəyal** – gözlədiyi ümidlərin, arzuların boşa çıxması dolayısı ilə insanda doğan məmnuniyyətsizlik hissi; məyusluq, ümidsizlik. *Görünür ki, Fərhadı inkisari-xəyala salan ən əsas fakt rəiyyətin halı deyil, özünün çıxılmaz vəziyyəti, gücsüzlüyü, əmisinin arzularına oyuncaq olmasıdır.* Ə.Haqverdiyev. *..Paşa atasını inkisari-xəyala uğratmamaq üçün onun sözlərini ucadan təsdiqlədi.* M.Hüseyn. *Küçəyə çıxdıqda, zülmət içində addımladıqda ani bir inkisari-xəyal məni aldı.* Mir Cəlal.

**İNKİŞAF** *is.* [*ər.*] İrəliyə doğru tərəqqi etmə, artma, yüksəlmə; tərəqqi, yüksəliş.

*Ölkənin inkişafı. Sənayenin inkişafı. Kənd təsərrüfatının inkişafı. – Həsən bəy Zərdabi Azərbaycanı feodal geriliyindən qurtarıb yeni yola, Avropa inkişafı yoluna çıxarmaq istəyirdi.* M.İbrahimov. ☐ **İnkişaf etdirmək** – 1) irəlilətmək, tərəqqi etdirmək, yüksəltmək. *Kütlələrin yaradıcılıq fəaliyyətini inkişaf etdirmək. Respublikada üzümçülüyü inkişaf etdirmək;* 2) kamilləşdirmək, təkmilləşdirmək, daha da artırmaq, daha da yaxşılaşdırmaq, möhkəmləndirmək, qüvvətləndirmək. *Səsini inkişaf etdirmək. Əzələləri inkişaf etdirmək. Hafizəni inkişaf etdirmək.* **İnkişaf etmək** – 1) tərəqqi etmək, irəliləmək, artmaq, yüksəlmək, genişlənmək. *İncəsənətimiz olduqca inkişaf etmişdir;* 2) kamilləşmək, yetkinləşmək, artmaq. *Axır zamanlar o, xeyli inkişaf etmişdir;* 3) böyümək, yetişmək, möhkəmlənmək, qüvvətlənmək. *İdman nəticəsində əzələləri olduqca inkişaf etmişdir.* **İnkişaf etmiş** – 1) yüksək səviyyəyə çatmış, sənaye, mədəniyyət və s. cəhətdən çox irəli getmiş, tərəqqi etmiş. *İnkişaf etmiş ölkələr;* 2) yetkinləşmiş, yetişmiş, kamilləşmiş, görüş dairəsi geniş, geniş məlumatlı; mədəni, hər cəhətdən yetkin. *İnkişaf etmiş adam.*

**İNKİŞAFSIZ** *sif.* Olduğu kimi qalan, artmayan, irəliləməyən, kamilləşməyən, inkişaf etməyən. *İnkişafsız* (z.) *qalmaq.*

**İNKUBÁSİYA** [*lat.*] 1. *tib.* Xəstəliyin yoluxucu andan birinci əlamətlərinin görünməsinə qədər çəkən gizli dövrü.

2. *k.t.* İnkubatorda süni cücə çıxarılması.

**İNKUBÁTOR** *is.* [*lat.*] Yumurtadan süni surətdə (külli miqdarda və ilin istənilən fəslində) cücə çıxarmaq üçün cihaz. – *İnkubator elə bir cihazdır ki, bu cihaz içərisində yumurta rüşeyminin inkişafı üçün lazım olan bütün şərait vardır.* "Zoologiya".

**İNKVİZÍSİYA** [*lat.*] *tar.* 1. Düşmənləri ilə ən vəhşi və amansız üsullarla mübarizə etmək üçün katolik kilsəsinin XIII əsrin əvvəlində təşkil etdiyi məhkəmə-polis təşkilatı. *Orta əsrin bir çox məşhur alimləri inkvizisiya tonqallarında yandırılmışdır. İnkvizisiya qurbanları.*

2. *məc.* İşgəncə, əzab, zülm.

**İNKVİZÍTOR** [*lat.*] 1. *tar.* İnkvizisiya məhkəməsinin üzvü (b a x **inkvizisiya** 1-ci mənada).

2. *məc.* Zalım, cəllad.

**İNKVİZİTORLUQ** *is.* Zalımlıq, cəlladlıq, amansızlıq, zülmkarlıq.

**İNQA, İNQA-İNQA** *təql.* Körpə uşaqların ağlamaq səsi. *İnqa-inqa deyib sevinir çağa; Bir ana qəlbində gülür kainat.* S.Vurğun. *Çağanın ilk inqasından Gülsənəm ağrı və qorxunu unudaraq, nazlı bir təbəssümlə üzünü o tərəfə çevirib gizlətdi.* S.Rəhimov.

**İNQİLAB** *is.* [*ər.*] 1. Zorakı ictimai çevriliş; dövlət hakimiyyətinin hakim sinfin əlindən başqa sinfin əlinə keçməsi. *1905-ci il inqilabı. Burjua inqilabları. İnqilab illəri. – Rusiya inqilabının bərəkətindən törəyən azadlıqların biri də vicdan azadlığıdır.* C.Məmmədquluzadə. [Yaşlı kişi:] *Dünya hadisələri ilə, İranda başlayan inqilab hərəkatı ilə maraqlanırdım.* S.Hüseyn.

2. Hər hansı bir elm sahəsində, texnikada, incəsənət və s. sahəsində əsaslı dəyişiklik. *Mədəni inqilab. – Sonra bir həkim çıxdı, yaş dəsmal üsulunun elm aləmində bir inqilab olduğunu söylədi.* Mir Cəlal.

3. *klas.* Dəyişiklik, dəyişkənlik. *Şahiddir ona bu inqilabın; Kim, aşiqisən bir afitabın.* Füzuli. *Yarəb, bugünkü məclisimiz xoş keçir bizim; Bu məclisi-məhəbbətə göstərmə inqilab.* S.Ə.Şirvani.

**İNQİLABBAZ** *sif.* və *is.* [*ər.* inqilab və *fars.* ...baz] *kin.* Yalandan özünü inqilabçı göstərən, inqilabla oynayan, inqilabdan öz məqsədləri üçün istifadə edən. *Eserlər, menşeviklər; İnqilabbaz vəzirlər; Hər tərəfdə .. gəzirlər.* R.Rza.

**İNQİLABBAZLIQ** *is. kin.* İnqilabbazın işi, hərəkəti.

**İNQİLABÇI** 1. *is.* İnqilab hərəkatı iştirakçısı, inqilab xadimi.

2. İnqilabi ideyalar daşıyan, inqilabi ruhda olan. *Arazla bir gündə həbsxanadan 80-ə yaxın inqilabçı fəhlə azad edilmişdi.* A.Şaiq. *Altı aydan artıq idi ki, Puan Qay Kanton inqilabçı ordusunda şücaətlə dava edirdi.* S.S.Axundov. *Üsyan alovları inqilabçı işçi-kəndlilər qanı ilə söndürüldü.* H.Nəzərli.

3. *məc.* Hər hansı bir elm sahəsində, texnikada və s.-də yenilik, çevriliş yaradan şəxs.

**İNQİLABÇILIQ** *is.* İnqilabi ruhda olma, inqilabi hərəkatda iştirak etmə; inqilabçının fəaliyyəti, işi, peşəsi. *Fəhlə sinfinin inqilabçılığı.*

**İNQİLABİ** *sif.* 1. İnqilaba aid olan, inqilab mahiyyəti daşıyan, inqilab ruhlu. *İnqilabi bayram. İnqilabi himn. İnqilabi mahnılar.* – *"Molla Nəsrəddin" inqilabi demokratizmin ifadəçisi və mərkəzi idi.* M.İbrahimov. *Texnoloji institutda çoxdan bəri inqilabi əhval-ruhiyyə kök salmağa başlamışdı.* M.Hüseyn.

2. İnqilab ideyalarını ifadə edən; inqilabçı. *İnqilabi sinif. İnqilabi xadim. İnqilabi ordu. İnqilabi qüvvələr.* // İnqilabı həyata keçirməyə doğru yönəldilmiş, inqilab yaratmaq məqsədini daşıyan. *İnqilabi mübarizə. İnqilabi çıxış. İnqilabi çevriliş.* – *İnqilabi hərəkatın getdikcə güclənməsi çar mütləqiyyətini qorxutmuşdu.* A.Şaiq. // İnqilab nəticəsində meydana gəlmiş, inqilabın yaratmış olduğu. *Fəhlə sinfinin inqilabi diktaturası. İnqilabi qanunlar. İnqilabi təşkilatlar. İnqilabi hökumət.*

**İNQİLABİLƏŞDİRİCİ** *sif.* İnqilab mahiyyəti, inqilab ruhu verən, inqilabiləşdirən. *Fəhlə hərəkatının inqilabiləşdirici qüvvəsi.*

**İNQİLABİLƏŞDİRİLMƏ** "İnqilabiləşdirilmək"dən *f.is.*

**İNQİLABİLƏŞDİRİLMƏK** *məch.* İnqilabi ruhda dəyişdirilmək, inqilabi mahiyyət verilmək.

**İNQİLABİLƏŞDİRMƏ** "İnqilabiləşdirmək"dən *f.is.*

**İNQİLABİLƏŞDİRMƏK** *f.* İnqilabi ruhda hazırlamaq, inqilabi hərəkata çevirmək, inqilabi xarakter vermək, inqilabi ideyaları yaymaq, inqilabi ruhda tərbiyələndirmək.

**İNQİLABİLƏŞMƏ** "İnqilabiləşmək"dən *f.is.*

**İNQİLABİLƏŞMƏK** *f.* İnqilabi ideyaları dərindən dərk etmək, mənimsəmək.

**İNQİRAZ** *is.* [*ər.*] Sonu kəsilmə, bitmə, sönmə, məhv olma. ☐ **İnqiraz etmək** – sonu kəsilmək, bitmək, məhv olmaq. **İnqirazi-aləm** *klas.* – qiyamət. [Əhməd:] *..Heç fikir eyləmə, kişi, Allah qoysa, ona tövbələmə verdirəcəyəm ki, inqirazi-aləmə kimi dadı damağından getməsin.* N.Vəzirov.

**İNQREDİYENT** *is.* [*lat.*] Mürəkkəb birləşmənin və ya qarışığın tərkib hissəsi.

**İNQUŞ** *is.* Çeçenlərə yaxın olan Şimali Qafqaz xalqlarından biri və bu xalqa mənsub adam. *İnquş dili. İnquş mahnıları.*

**İNQUŞCA** *zərf* və *sif.* İnquş dilində. *İnquşca öyrənmək. İnquşca danışmaq.*

**İNLƏMƏ** "İnləmək"dən *f.is.*

**İNLƏMƏK** bax **inildəmək**. [Ərən:] *Günəş çıxandan batana qədər ağır işdən inləyən qullar Mariqerini sevinclə qarşıladılar.* Çəmənzəminli. *İnlədikcə azalmır; Dərdlərimiz daha da; Ürəkdə göz-göz olur.* B.Vahabzadə. *İlk eşqim yuxutək çəkildi göyə; Könlümün sazında inlədi bir sim.* H.Arif.

**İNLƏTMƏ** "İnlətmək"dən *f.is.*

**İNLƏTMƏK** bax **inildətmək**. [İnci:] *..Köksümün içində çarpan ürəkdir; Məni də inlədən tək bir diləkdir.* A.Şaiq. [Elxan:] *Bu səs bir xatirat mizrabı kimi qəlbimin bütün tellərini inlətdi.* C.Cabbarlı. *Vermişlər səs-səsə xanəndə və tar; İnlədir dağları şikəstə, qatar.* H.K.Sanılı.

**İNLƏYİŞ** *is.* İnilti, inləmə. *İnləyirsən, o inləyiş nə üçündür, qafilsən; Bilmədinmi hansı sinfin mədfənidir o məskən?* M.S.Ordubadi.

**İNNAB** *is.* [*ər.*] 1. Açıq-sarı çiçəkləri olan, quraqlığa davamlı ağac və bu ağacın qırmızı qabıqlı, bərk çəyirdəkli xırda, şirin meyvəsi.

2. Klassik şeirdə qırmızılıq mənasında tərkiblərdə işlənir; məs.: şərbəti-innab (qırmızı şərbət), ləbi-innab (qırmızı dodaq). *..Dərdi-eşqdə bununçun ləbi-innab gərək; Bir belə dərdi nə Loğman, nə Əflatun istər.* Aciz. *Mən özüm bilirəm şərbəti-innab; Dəfi-hərarəti-cigərdir mənə.* Q.Zakir.

**İNNABI**[1] *sif.* İnnab rəngində, qırmızı. *İnnabı parça.* – *Simi-zənəxdandı, mirvaridəndan; İnnabı ləbləri can dərmanıdı.* Aşıq Ələsgər. [Buğacın] *ayağında gen innabı şalvar .. var idi.* M.Rzaquluzadə.

**İNNABI**[2] *is. mus.* Azərbaycan xalq oyun havalarından birinin adı.

**İNNABLIQ** *is.* İnnab ağacları əkilmiş yer. *Bağ başdan-başa innablıqdır.*

**İNNERVÁSİYA** *is.* [*lat.*] *anat.* Bədənin və ya toxumanın qeyri-bərabər elementlərlə təchizi.

**İNSAF** *is.* [*ər.*] 1. İnsanda vicdan və ədalət hissi, öz hərəkətləri üçün mənəvi məsuliyyət hissi; vicdana müvafiq hərəkət. *İnsaf dinin yarısıdır*. (Ata. sözü). *Bəylərin bəyisən, xanların xanı; Unutma insafı, satma imanı..* Aşıq Ələsgər. *İnsafımın və vicdanımın yanında məsul olaram, əgər yalan desəm ki, təqribən yarım saat mənim təamım çəkdi..* C.Məmmədquluzadə. // Rəhm, mürüvvət, şəfqət, ədalət. *İnsaf xoşdur, ey eşq, ancaq məni zəbuni et; Ha böylə möhnət ilə keçsinmi ruzigarım?* Füzuli. *Könlündə qalmadı insaf əsəri; Dürdanənin qəlbi sal buza döndü.* M.Rahim. *Məsmənin qəlbini dağlayan fələkin "çərxi çevrilmiş", fələkin zərrə qədər insafı, mürüvvəti yoxmuş!* Mir Cəlal. ☐ **İnsaf deyil** – rəva deyil, insafa müğayirdir. [Məmməd:] *Yox, bu insaf deyil ki, bu cür nəcib heyvanın leşini mən bu çöldə dəfn etməmiş gedim..* E.Sultanov. **İnsaf etmək (eləmək)** – rəhm etmək, mərhəmət göstərmək, ədalətlə yanaşmaq. *Ömür keçdi, insaf elə, sevdiyim; Nə müddətdi dərdü möhnət çəkirəm.* Q.Zakir. *Vəfa rəsmin tutub gəl, ey pəri, cövrü cəfadan keç; Əgər adəmsən, insaf et, bu vəzi-narəvadən keç.* S.Ə.Şirvani. **İnsaf görmək** – vicdanı qəbul etmək, rəva görmək. **İnsafa gəlmək (düşmək)** – rəhmə gəlmək, insaf eləmək; haqsızlıq etməkdən vaz keçmək, mərhəmət etmək. *Eləmi qaldı səbir; Qovğadı, qaldı səbir; Nə yar insafa gəldi; Nə məndə qaldı səbir.* (Bayatı). *İnsafa gəl, aman! Məni məhv etdi intizar; Səbrim tükəndi, yox qəmi-hicranə taqətim.* H.Cavid. **İnsafa gətirmək** – rəhmə gətirmək, ürəyində mərhəmət oyatmaq. **İnsafdan çıxmaq** – haqsızlıq, ədalətsizlik etmək, birinin haqqını pozmaq, insaf və vicdana müğayir hərəkət etmək. **İnsafı itirmək** – bax **insafdan çıxmaq**. **İnsafı yol verməmək** – insafı, vicdanı rəva görməmək, insaf görməmək, rəva görməmək. *Doğrusu, belə bir nazənin sənəmin sumkasının boş olmasına insafım yol vermədi.* Ə.Haqverdiyev. [Dəmirçi Rzaya:] *..Səni beş qrana işlətməyə insafım yol vermir, artığa da gücüm çatmaz..* M.İbrahimov. **Allah ... insaf versin** – ədalətli, insaflı olmağa dəvət. [Qurban:] *Allah Zərnigar qarıya insaf versin.* Ə.Haqverdiyev.

2. **İnsafla** şəklində – düzlüklə, ədalətlə, vicdanla. *Dünyada hər nə cür və xariqüladə bir məsələ bəsirət və insafla müzakirə olunsa, şəksiz, həqiqət tərəfi axtarılar.* C.Məmmədquluzadə.

3. **İnsafdır(mı)** şəklində – rəvadırmı, insafa, vicdana, ədalətə uyan şeydirmi? *İnsafdırmı, Bəlli Əhməd tutula; Qolac qolu dal gərdənə çatıla.* "Koroğlu".

**İNSAFƏN** *zərf* [*ər.*] İnsafla deyilsə, düzü deyilsə, həqiqətdə (təsdiq bildirir). *İnsafən o, yaxşı işçidir. İnsafən yaxşı uşaqdır.* – *İnsafən* [Murad bəydə] *padşah cəlalı vardı.* Qantəmir. *..Gülər insafən ən gözəl bir qız idi.* C.Cabbarlı. *Bu gözəllik ki sənin var, gözəlim, insafən; Nə mələkdə, nə pəridə, nə bir insandə olur.* Ə.Vahid.

**İNSAFLI** *sif.* İnsafı olan, insafla iş görən. *İnsaflı adam.* – [Vəli bəy:] *Çox insaflı adamsan, mən çalışmağımı hesab etmirəm, çünki dost dost yolunda canını da qoyar.* S.S.Axundov. *Qoy Mehribanın Zeynal ilə Naşada verdiyi bu sualı hər bir insaflı kişi özünə versin.* S.Hüseyn.

**İNSAFSIZ** *sif.* 1. İnsaflı olmayan, mürüvvətsiz; zalım, qəddar, rəhmsiz. *İnsafsız günəş də ki batmaq bilmirdi.* E.Sultanov. *İnsafsız, avam bir adam olan əmim arvadı iri mis səhəngi çiynimə verib səhərdən axşama qədər mənə ayaqyalın, başıaçıq su daşıtdırardı.* İ.Əfəndiyev. // Zərf mənasında. [Orxan:] *Məndə artıq can qalmamış, Mərhəmət; Mərhəmət qıl, insafsız olma, İsmət!* H.Cavid.

2. Vicdansız, şərəfsiz. *Zeynəbin özü Məcidə xəbər verdiyini Nadir indi güman etdi və hər ikisi tərəfindən belə insafsız* (z.) *bir tərzdə aldandığına acıdı.* B.Talıblı. // İs. mənasında. *Bilmirəm bu yanlış məlumatı gözəl qıza hansı bir insafsız xəbər vermişdir.* M.S.Ordubadi. *Sərt oldu rəftarı o insafsızın; Dərslərinə vaxtı qalmadı qızın.* M.Rahim.

**İNSAFSIZCA(SINA)** *zərf* Rəhmsizcəsinə, amansızcasına, vəhşicəsinə. [Ərəblinskini] *insafsızcasına döymüşdülər.* S.Rəhimov. // Vicdansızcasına, haqsızcasına, həyasızcasına. *Onu insafsızcasına aldatmışlar.*

**İNSAFSIZLIQ** *is.* Rəhmsizlik, mürüvvətsizlik; zalımlıq, qəddarlıq. // Vicdansızlıq,

ədalətsizlik, haqsızlıq; vicdansız, haqsız hərəkət. □ **İnsafsızlıq etmək** – ədalətsiz, vicdansız hərəkət etmək, haqsızlıq etmək. *Veys haqqında insafsızlıq etdiyi başqa bir tərəfdən də Çimnaza ağır gəlirdi.* Ə.Əbülhəsən.

**İNSAN** *is.* [*ər.*] 1. Adam, bəşər. *Ey mələksima ki səndən özgə heyrandır sana; Həq bilir, insan deməz, hər kim ki insandır, sana.* Füzuli. *Ancaq onu da bilməmiş deyilsən ki, insan mələk deyil.* M.Hüseyn. *İnsan özü qocalsa da; Ürəyi yüz yaşında da qocalmayır.* B.Vahabzadə.

2. İnsaniyyətli, vicdanlı adam. *Çox insan adamdır. – Murad kişi bağbandır; Çox mehriban insandır.* M.Rahim.

◊ **İnsan oğlu** – adam, insan. *İnsan oğlu, uzaqlaşma, gəl yaxın; Başqa yerdən alınmasın sorağın.* M.Müşfiq.

**İNSANABƏNZƏR** *sif.* İnsana oxşayan, adama oxşayan, insanı xatırladan.

◊ **İnsanabənzər meymunlar** *zool.* – qorilla, gibbon, oranqutanq və şimpanzenin mənsub olduğu meymunlar fəsiləsinin adı. *Qədim insanabənzər meymunlar hələ meşələrdə yaşadıqları dövrdə onların əlləri və ayaqları ağac həyatına əlverişli surətdə uyğunlaşmışdı.* M.Axundov.

**İNSANCASINA** *zərf* və *sif.* İnsana yaraşan tərzdə, insana layiq, insan kimi. *İnsancasına rəftar. İnsancasına münasibət. İnsancasına hərəkət etmək.*

**İNSANDANQAÇAN** b a x **adamdanqaçan**.

**İNSANGİRİZ** [*ər.* insan və *fars.* ...giriz] b a x **insandanqaçan**.

**İNSANİ** *sif.* [*ər.*] İnsana xas olan, insana aid olan; bəşəri. *Yüksək insani ləyaqət. – Cabbarlının qəhrəmanları nəcib insani hisslərə malikdirlər.* M.Arif. *Veysin yaxşı evdə rahat və gözəl yaşamaq meyli ən insani meyildir.* Ə.Əbülhəsən.

**İNSANİYYƏT** *is.* [*ər.*] 1. *top.* Bütün insanlar, bəşəriyyət, insan övladı, insan cəmiyyəti. [Abdulla bəy Asi və S.Ə.Şirvaninin] *də məslək və əqidəsi və baş arzuları ümumi bəşərin və insaniyyət aləminin səadətidir.* F.Köçərli. [Əli:] *Din bir əmri-vaqe olaraq, insaniyyətlə bərabər doğmuş və əsrlərdən bəri dolanbac tarix yollarında onu təqib edir.* Çəmənzəminli.

2. İnsanpərvərlik, insanlıq, insana yaraşan sifət və fəzilətlər, mürüvvət. *Bu zəhmətlər şərh olunmaz, uzundur: İnsaniyyət həp bunlara mədyundur.* A.Səhhət. *Həbib Gözəlin evində hərarət, körpələrində ünsiyyət, özündə mərhəmət gördüyü kimi, Gözəl də Həbibdə insaniyyət, mehribanlıq hiss edirdi.* Ə.Vəliyev.

**İNSANİYYƏTPƏRVƏR** [*ər.* insaniyyət və *fars.* ...pərvər] b a x **insanpərvər**. *..Fərhad oxumuş olduğu üçün* [Aslan] *onu özündən daha mərhəmətli, insaniyyətpərvər və safdilədd edirdi.* C.Cabbarlı.

**İNSANİYYƏTPƏRVƏRLİK** b a x **insanpərvərlik**. [Məktubda belə yazılmışdı] *"..Daima insaniyyətpərvərlikdə və qan qardaşlığına himmət göstərmənizi arzu edirik..".* Ə.Əbülhəsən.

**İNSANİYYƏTSİZ** *sif.* İnsaniyyəti, insanlığı olmayan, insanlıq sifət və fəzilətlərindən məhrum; mürüvvətsiz, vicdansız. *İnsaniyyətsiz adamdı.*

**İNSANİYYƏTSİZLİK** *is.* İnsaniyyəti, insanlığı olmayan adamın hal və sifəti; mürüvvətsizlik, vicdansızlıq.

**İNSANLIQ** *is.* 1. *top.* Bəşəriyyət, insanlar. *Sən mükafatını insanlığa xidmətdə ara; Əbədi zövqü, təsəllini həqiqətdə ara.* A.Səhhət. *Dünyada səfalət və fəlakət yalnız insanlığın yoxsul qisminə nəsib imiş.* A.Şaiq. *İnsanlığa Tusilər, Səbuhilər verdik biz; Şerimizin qüdrəti bir dənizdir, bir dəniz.* R.Rza. *Qoy bütün insanlıq səcdənə gəlsin; Ey şəhid qanından qızaran bayraq!* B.Vahabzadə.

2. *məc.* İnsanpərvərlik, əsil insana xas olan sifət və fəzilətlər; mürüvvət. *Kim ki insanı sevər, aşiqi-hürriyyət olur; Bəli, hürriyyət olan yerdə də insanlıq olur.* M.Ə.Sabir. *Yox kimsədə mərhəmətlə vicdan; İnsanlığı həp unutdu insan.* H.Cavid. *Rəşidin bu insanlığını və hümmətini hər kəs bildi.* İ.Musabəyov. □ **İnsanlıq sifətini itirmək** – ədalətsiz, qeyri-vicdani iş görmək, insan adına layiq olmayan hərəkətlərə yol vermək. *Kömək etmək imkanı əldə ikən bu vəzifədən boyun qaçırmaq insanlıq sifətini itirmək deməkdir.* M.S.Ordubadi.

**İNSANPƏRVƏR** *sif.* [*ər.* insan və *fars.* ...pərvər] İnsanları sevən, insanlara məhəbbət bəsləyən; humanist. *İki ağıllı, aydın fikirli, nəcib və mədəni gəncin .. faciəsində böyük demokrat və insanpərvər ədibin ictimai ədalətsizliyə qarşı qüvvətli etirazı meydana çıxır.* M.Arif.

**İNSANPƏRVƏRCƏSİNƏ** b a x **insancasına**.

**İNSANPƏRVƏRLİK** *is.* İnsanları sevmə, insanlara məhəbbət bəsləmə, onlara kömək etməyə hazır olma; humanizm. *..Azərbaycan xalqının müqəddəs insanpərvərlik duyğuları həmişə ətirli bir çiçəyi andıran "Əsli-Kərəm" dastanında öz ifadəsini tapmışdır.* M.İbrahimov. *Səməd Vurğunun insanpərvərliyi .. yeni və yüksək idealların ifadəsidir.* M.Arif.

**İNSANSEVƏN, İNSANSEVƏR** b a x **insanpərvər**.

**İNSANSEVƏRLİK** b a x **insanpərvərlik**.

**İNSANSEVMƏZ** *sif.* Adamdanqaçan, insanlara məhəbbəti olmayan, adamları sevməyən.

**İNSANSEVMƏZLİK** *is.* İnsanlara qarşı nifrət, adamlara qarşı kin; insanları sevməmə.

**İNSANSIZ** *sif.* İnsan olmayan, insan yaşamayan; adamsız. *İnsansız yerlər.* – *..İnsansız təbiət Mirzəyə sanki həmlə edirdi.* S.Rəhimov. // Zərf mənasında. *Bilirsən ki, sən; Günəşsiz, insansız yaşamadım mən!..* Z.Xəlil.

**İNS-CİNS** *is.* [*ər.*] "Üns" (insan) və "cins" sözlərinin dəyişilmiş şəkli olub, "bəşər, insan, canlı" mənasında işlənir. *Məhbusi hələ bu vaxta qədər ..* [Tehranda] *qapıçıdan başqa bir ins-cinsə rast gəlməmişdi.* M.İbrahimov. *..Əjdər ətrafa nəzər saldı, ins-cins yox idi.* S.Rəhman.

**İNSOLYÁSİYA** *is.* [*lat.*] Günəş radiasiyası.

**İNSPÉKTOR** *is*. [*lat.*] 1. Hər hansı bir sahədə işlərin düzgün aparılması və qanunlara düzgün əməl edilməsi üzərində nəzarət edən vəzifəli şəxs; nəzarətçi. *Maliyyə inspektoru. Sanitar inspektoru. Maarif şöbəsinin inspektoru.* – *Bir gün dərs zamanı dərslərimizin gedişini yoxlamaq üçün Tiflisdən məktəbə nəzarət etməyə gəlmiş Qafqaz Maarif Dairəsi baş inspektoru Slavinski sinfə daxil oldu.* T.Ş.Simurq. *Qəhrəman istəyirdi ki, bütün məktəb inspektorun nəzərində yaxşı çıxsın.* S.Rəhimov. [Müəllim:] *Görürsünüz, balam, odur, yamacdan aşağı düşən inspektordur.* Mir Cəlal.

2. Bolşevik inqilabından əvvəl məktəb direktorunun tərbiyə və tədris işlərinə baxan müavini. *Hər bir şeydən əvvəl, cənab inspektor bunu özünə vacib gördü ki, realnı şkolada müsəlman uşaqlarının arasına "sünni-şiə" ədavəti salsın.* C.Məmmədquluzadə.

**İNSPEKTORLUQ** *is.* İnspektor vəzifəsi. *İnspektorluq etmək. İnspektorluğa təyin olunmaq.*

**İNSTÁNSİYA** *is.* [*lat.*] Vəzifə pillələri.

**İNSTÍNKT** [*lat.*] 1. *biol.* Canlıların, daxili və ya xarici mühitin dəyişməsinə cavab olaraq anadangəlmə, qeyri-şüuri və qeyri-iradi məqsədəuyğun hərəkət etmə və ya iş görmə qabiliyyəti; sövqi-təbiyyə. *Özünü mühafizə instinkti.*

2. Qeyri-şüuri, qeyri-iradi, önüalınmaz həvəs, hiss, duyğu. [Əhməd] *instinktlə qan ləkəsi olub-olmadığını bilmək üçün əlinə və üst-başına diqqət etdi.* Ə.Əbülhəsən.

**İNSTİNKTÍV** *sif.* [*lat.*] 1. *biol.* İnstinktə aid olan, instinktdən törəyən (b a x **instinkt** 1-ci mənada). *Arıların şan və ya quşların yuva tikməsi, quşların isti ölkələrə köçmələri instinktiv hərəkətlərə misal ola bilər.* "Psixologiya".

2. Qeyri-iradi, qeyri-şüuri. *İnstinktiv hərəkət.*

**İNSTİTÚT** [*lat.*] 1. Bəzi elmi-tədqiqat idarələrinin adı. *Dilçilik institutu. Elmi tədqiqat institutu.*

2. Bolşevik inqilabından əvvəl: imtiyazlı siniflərdən olan qızlar üçün qapalı orta məktəb. *Dünən cənab şeyxülislam "institut" məktəbində müsəlman qızlarının birindən soruşub ki: "Pəs niyə anan bu gün məktəbə gəlmədi?"* C.Məmmədquluzadə.

3. *hüq.* İctimai münasibəti, yaxud biri-biri ilə bağlı olan münasibətləri nizama salan hüquq normalarının məcmusu. // İctimai quruluşun bu və ya başqa forması.

**İNSTRUMENTÁL** *sif.* [*lat.*] Müxtəlif musiqi alətlərində ifa olunan musiqi alətlərin-

də çalınmaq üçün yazılmış. *İnstrumental musiqi. – Sonata müəyyən ideya və məzmun əsasında bəstələnən mürəkkəb instrumental musiqi əsəridir.* Ə.Bədəlbəyli.

**İNSTRUMENTALÇI** *is. mus.* Hər hansı bir musiqi alətində çalan çalğıçı. *Xanəndə və instrumentalçılardan ibarət ansambl. – Qurban Pirimov bir instrumentalçı olmaqla bərabər, Azərbaycan vokal musiqisinin bütün incəliklərini çox yaxşı bilən bir sənətkar* [idi]. Ə.Bədəlbəyli.

**İNSTRUMENTÓVKA** [*rus.*] *mus.* 1. Bir musiqi əsərinin orkestr və ya instrumental ansambl tərəfindən çalınmaq üçün uyğunlaşdırılması. *İnstrumentovkada orkestrovka – orkestr üçün yazılan əsərdə səslərin ayrı-ayrı musiqi alətləri arasında bölüşdürülərək tərtib edilməsi*(*dir*). Ə.Bədəlbəyli.

2. Musiqi nəzəriyyəsinin, ayrı-ayrı musiqi alətlərinin xüsusiyyətlərindən və orkestrdə onların bir-birinə uyması prinsiplərindən bəhs edən şöbəsi.

**İNSULÍN** [*lat.*] *əcz.* Heyvanların mədəaltı vəzilərindən alınan hormon (orqanizmdə karbohidrat mübadiləsində iştirak edir). [Həkim:] *Diabetsən; Özünlə insulin götür; Hara getsən.* R.Rza.

**İNSULT** *is.* [*lat.*] Beyin qan damarlarının kəskin pozulması.

**İNŞA** *is.* [*ər.*] *köhn.* 1. Qayırma, yaratma, qurma, vücuda gətirmə, tikmə. *Gəmi inşası. Mədən inşası. – Xəndəkdə qazıntı işləri qurtarandan sonra, dörd iri borunun inşasına başlanacaqdı.* Ə.Sadıq. □ **İnşa etmək** – qurmaq, yaratmaq, quraşdırmaq, qayırmaq. *Fərdi evlər birtipli layihələr üzrə inşa edilir.* (Qəzetlərdən). *Sadıq ilə Rəhilə bir kömürçü çocuqları idilər. Ormanda .. inşa edilmiş bir külbədə sakin olurlardı.* C.Cabbarlı. [Qulam müəllim:] ..*Qoy bu qızlardan birisi xəstələrimizə şəfa versin, .. o birisi də bizim bu dağlı məhəlləsində yeni-yeni binalar inşa etsin.* S.Rəhimov.

2. Qələmə alma, bir mətləbi ədəbi şəkildə ifadə etmə, yazma. [Bahadır:] *İnşa yazanlarımıza baxırsan, "əlfazlar" o qədər gözlərini kor edib ki, əsli məqsudu yaddan unudublar.* N.Nərimanov. □ **İnşa etmək** – qələmə almaq, bir mətləbi ədəbi şəkildə ifadə etmək, əsər yazmaq. *Vamberi ismində bir* [alman] *ki müsəlman vilayətlərində səyahət edib, indi "İslam" adlı bir kitab inşa edib.* "Əkinçi". [Vaqif] *Ağa Məhəmməd şahın Şuşa qələsində qətlə yetişməyi barəsində bu şeirləri inşa edib, Molla Vəliyə göndərmişdi.* F.Köçərli. *Şair cənabları da Münəvvər xanımın gözəlliyinə dair bir yaxşı qəzəl inşa etdi.* M.S.Ordubadi. // Şagirdlərin təfəkkürünü və yaradıcılıq təsəvvürlərini, yazmaq qabiliyyətlərini inkişaf etdirmək məqsədi ilə aparılan sərbəst yazı işi. [Zəki əfəndi:] *Biz sənə burada bir tema verərik və burada bizim gözümüzün qabağında haman temaya bir inşa yazarsan.* C.Məmmədquluzadə. *Diktə və inşa kimi yazı qisimlərini köhnə məktəb bilməzdi.* F.Ağazadə. [C.Cabbarlı] *nəinki imlanı, hətta inşanı da səhvsiz yazırdı, müəllimlər də onu tərifləyirdilər.* M.Arif.

3. Keçmişdə: məktublaşma üsullarını öyrətmək üçün müxtəlif məktub, təbriknamə, təziyənamə, ərizə, müqavilənamə və s. nümunələri olan kitab, məcmuə.

**İNŞAAT** *is.* [*ər.* "inşa" söz. cəmi] Tikinti, tikinti işləri. *İnşaat materialı. İnşaat mühəndisi. İnşaat idarələri.* – [Rüstəm kişi:] *..Dağılışın hərə öz işinə. Biz də elə yaxındakı inşaatdan başlayaq, mədəniyyət evi tikirik.* M.İbrahimov. *İnşaat briqadasının üzvləri də, .. İmanovla Tahir də bu qayığa minib yola düşdülər.* M.Hüseyn.

**İNŞAATÇI** *is.* İnşaat işləri ilə məşğul olan adam, bina və s. tikən. *Əməkdar inşaatçı* (fəxri adı). // İnşaat işçisi. *O gün dünyanı bürüyən, bu göyün üst qatlarına qalxan şənlik və sevinc səslərini .. inşaatçılar, metalçılar şəhərində də eşitmək olardı.* Mir Cəlal. *İnşaatçıların çoxu mövsüm işçilərindən: torpaqqazanlar, bənnalar və dülgərlərdən ibarət idi.* Ə.Sadıq. // Sif. mənasında. *İnşaatçı mühəndis.*

**İNŞAD** *is.* [*ər.*] *şair.* Bir ədəbi parçanı yüksək səslə və gözəl bir əda ilə oxuma; deklamasiya. □ **İnşad etmək (eləmək)** – şeir demək, şeir yazmaq. *Şairim! Seyr elə ətrafı, təbiət nə gözəl; Bax mənim hüsnümə, inşad elə bir dadlı qəzəl.* A.Səhhət. *Hər kəs inşad eyləmişdir bir kitab; Ta ki izhar eyləsin bir inqilab.* H.Cavid. *Şair deyiləm, vəzn ilə şeir*

*eyləyim inşad; Ancaq yazıram, xalq arasında qazanım ad.* C.Cabbarlı.

**İNŞALLAH** *ara s.* [*ər.*] “Allah qoysa”, “Allah deyən olsa”, “Allah istəsə”, “Allahın iradəsi olsa” mənalarında xeyir-dua, dilək təbiri. [Mozalan bəy:] *Sabah saat xoşdur, inşallah, günorta maşını ilə yola düşərsiniz.* Ə.Haqverdiyev. [Ocaqqulu:] *Ağa, – dedi, – Tiflis pis deyil, inşallah, daha da yaxşı olar.* Çəmənzəminli. [Səfər bəy:] *Heç qorxma, inşallah, salamat qurtararıq. Qənbərqulu, get, qızı gətir, aparaq.* B.Talıblı. // Bəzən istehza məqamında işlənir. [Məşədi İbad:] *Görəsən, bunların hamısının hamam pulunu, inşallah, mən verəcəyəm?* Ü.Hacıbəyov.

**İNTEQRÁL** [*lat.*] *riyaz.* İntəhasız dərəcədə kiçik hissələrin məcmusu kimi götürülən tam kəmiyyət.

**İNTEQRALLAMA** “İnteqrallamaq”dan *f.is.*

**İNTEQRALLAMAQ** *f. riyaz.* Verilmiş kəmiyyətin inteqralını tapmaq.

**İNTEQRALLAYICI** b a x **inteqrator**.

**İNTEQRASİYA** *is.* [*lat.*] Əlahiddə hissələrin tamda birləşməsi haqqında sistemlər nəzəriyyəsi anlayışı və bu nəzəriyyənin obyekti olan təbii və ya ictimai proseslər.

**İNTEQRÁTOR** *xüs.* Avtomatik hesablama aparatı.

**İNTEL(L)İGÉNT** [*lat.*] Ziyalı təbəqəsinə mənsub adam (bəzən istehza yerində işlənir). *Bu inteligentlərin sözün gətirmə heç aralığa; Oları görmək istəsən, şərabı gör, qumarı gör!* M.Ə.Sabir. [Rüstəm bəy Məşədi İbada:] *..Birisi qəzetəçi Rzadır ki, tanıyırsan. Biri də .. inteligent Həsəndir ki, onu tanımazsan.* Ü.Hacıbəyov.

**İNTEL(L)İGENTLİK** *is.* Ziyalılıq. [Musanın nəvəsi] *gedib Qori seminariyasına girdi. Bir il də orada oxudu, onun əsil intelligentlik həyatı da bu tarixdən başladı.* Qantəmir.

**İNTENDÁNT** [*fr.*] *hərb.* Orduda və ya qoşun hissələrində təsərrüfat işlərinə baxan hərbi qulluqçu. *İntendant vəzifəsi.*

◊ **İntendant xidməti** – silahlı qüvvələrin təsərrüfat və təchizat işlərinə baxan idarələr sistemi.

**İNTENDANTLIQ** *is.* 1. Ordunun təchizat və təsərrüfat işlərinə baxan hərbi idarə.

2. İntendant vəzifəsi. *İntendantlıq etmək.*

**İNTENSÍV** *sif.* [*lat.*] Gərgin, güclü, qızğın. *İntensiv iş. – Üçpərli balta ilə işlərkən quyuda gilli məhlulun cərəyanı da nisbətən intensiv* (z.) *olmalıdır ki, külli miqdarda qazılmış süxur tamamilə qaldırılsın və quyunun dibi təmiz olsun.* S.Quliyev.

2. Daha böyük səmərə verən, daha məhsuldar. *İntensiv üsul.* ☐ **İntensiv kənd təsərrüfatı** – istifadə olunan torpaq sahəsinin hər bir vahidinə böyük xərc və səy qoyma əsasında qurulmuş kənd təsərrüfatı istehsalı sistemi.

**İNTENSİVLƏŞDİRİLMƏ** “İntensivləşdirilmək”dən *f.is.* *İş üsullarının intensivləşdirilməsi.*

**İNTENSİVLƏŞDİRİLMƏK** *məch.* Daha intensiv (məhsuldar, səmərəli) edilmək, intensivliyi daha da artırılmaq.

**İNTENSİVLƏŞDİRMƏ** “İntensivləşdirmək”dən *f.is.*

**İNTENSİVLƏŞDİRMƏK** *f.* Daha intensiv etmək, intensivliyini artırmaq, daha məhsuldar, daha səmərəli etmək. *Kənd təsərrüfatını intensivləşdirmək. İstehsal proseslərini intensivləşdirmək.*

**İNTENSİVLİK** *is.* 1. Səmərəlilik, məhsuldarlıq. *Əməyin intensivliyi.*

2. Gərginlik, qızğın fəaliyyət.

**İNTERÉS** [*lat.*] *dan.* b a x **mənafe**. *Bu işdə onun heç bir interesi yoxdur.* – [Əlisəfa:] *Mənim bunda bir interesim yoxdur.* S.Hüseyn.

**İNTERLǘDİYA** [*ital.*] *mus.* Bir musiqi əsərinin hissələri arasında çalınan və onları bir-birinə bağlayan başqa kiçik musiqi pyesi və ya parçası.

**İNTERMÉDİYA** [*ital.*] 1. Dram və ya opera tamaşasının pərdələri arasında göstərilən kiçik komik səhnə və ya pyes.

2. *mus.* b a x **interlüdiya**.

**İNTERMÉSSO** [*ital.*] *mus.* Sərbəst formalı kiçik instrumental pyes, bəzən operanın ortasında orkestr tərəfindən çalınan kiçik müstəqil musiqi pyesi. *Sevgilisi Aşıq Qəribdən ayrı düşmüş Şahsənəmin hicran kədərləri, R.Qliyerin “Şahsənəm” operasının üçüncü pərdəsində orkestrin müşayiəti ilə skripkanın çaldığı solo* (*çargah*) *ilə ifadə edilir. Bu da intermesso formasıdır.* Ə.Bədəlbəyli.

**İNTERNASİONÁL** [*fr.*] 1. Bax **beynəlmiləl**. [Tofiq:] *A kişi, eşqin nə ruscası, nə azərbaycancası! Eşq internasionaldır.* M.İbrahimov.

2. *tar*. Beynəlmiləl proletar himninin və Sovet İttifaqı Kommunist Partiyası himninin adı.

**İNTERNASİONALÍST** [*fransızcadan*] bax **beynəlmiləlçi**.

**İNTERNASİONALÍZM** [*fr.*] bax **beynəlmiləlçilik**. *Humanizm, xəlqilik, internasionalizm C.Məmmədquluzadənin yaradıcılığının ana xəttidir, canıdır.* M.İbrahimov.

**İNTERNÁT** [*lat.*] 1. Məktəb yanında şagirdlər üçün ümumi yataqxana.

2. Şagirdlərin oxuyub yaşadıqları qapalı məktəb. *Cari dərs ilindən etibarən şəhərdə internat təşkil edilmişdir.* (Qəzetlərdən).

**İNTERNET** [*lat.* inter – ...arasında və *ing.* net – şəbəkə] Bütün dünyada milyonlarla kompyuter vahid informasiya sisteminə birləşdirilən, elmi bilgilərin, işgüzar, əyləncəli və b. məlumatların azad mübadiləsi üçün ən geniş imkanlara malik olan qlobal kompyuter şəbəkəsi. *İnternet səhifələrində yer alan materiallar. İnternetə qoşulmaq. İnternet vasitəsilə məktublaşmaq.*

**İNTERVÁL** [*lat.*] 1. Bir şeyi digərindən ayıran ara, aralıq, məsafə. *İntervalı gözləmək.*

2. *mus. fiz.* Eyni zamanda və ya bir-birinin ardınca çıxarılan iki səs arasındakı yüksəklikcə fərq. *Əgər əsas not ilə yardımçı böyük sekunda intervalı əmələ gətirirsə, o zaman daha yaxşı təsir yaratmaq üçün yardımçı not yarım ton alçaldılır.* Ü.Hacıbəyov.

**İNTERYÉR** [*fr.*] 1. *arxit.* Binanın, mənzilin memarlıq və bədii cəhətdən tərtiblənmiş daxili hissəsi. *Metro stansiyasının interyeri. Yaşayış mənzilinin interyeri.*

2. *sənət.* Binanın, mənzilin daxili sahəsini təsvir edən şəkil, rəsm.

**İNTƏHA** *is.* [*ər.*] Son, axır, nəhayət, qurtaracaq. *Məndən ötrü bu şadlığın intəha və əvəzi yox idi.* T.Ş.Simurq.

**İNTƏHASI** *ara s.* Axırı, qurtaranı, nəhayət, xülasə. *..İntəhası, iki-üç saat vaxt kifayətdir.* C.Məmmədquluzadə. *İntəhası, dava var uzun olur, qısa olur, sənə yaxın, ya uzaq olur.* Mir Cəlal. [Daşdəmir:] *Allah eləməsin, ay Sərvinaz nənə, intəhası, mən burda az oluram, yaylaqdan yeni gəlmişəm.* B.Bayramov.

**İNTƏHASIZ** *sif.* Sonu, axırı olmayan, nəhayətsiz, sonsuz. *Bir gecə azarın intəhasız şiddətində şeyx gördü ki, qapı açıldı və Gülsüm daxil olub qapının arasında dayandı.* Ə.Haqverdiyev. [Qarı:] *Əhməd qızını intəhasız, hədsiz-hesabsız sevibdir.* A.Divanbəyoğlu. *Şirvan düzü intəhasız bir dəniz kimi görünürdü.* Ə.Vəliyev.

**İNTƏHASIZLIQ** *is.* Sonsuzluq, nəhayətsizlik; sonu, axırı olmama. [Nuriyyəyə] *elə gəlirdi ki, dünyada zaman, məkan deyilən şey yoxdur, bizim əqlimizin dərk edə biləcəyi əbədi bir boşluq, bir intəhasızlıq var.* İ.Əfəndiyev.

**İNTİBA** *is.* [*ər.*] Bir şeyin zehində buraxdığı iz, təəssürat. *Məryəm Bakıdan gəldiyi bir neçə gün müddətində gəzib tanış olduğu yerlərdən aldığı ilk intibaları xatırlayır*(*dı*). M.Hüseyn. *Cabbarlının əsərlərini oxuyarkən və ya onlara tamaşa edərkən bizdə nə qədər xoş və gözəl hisslər, fikirlər, yeni intibalar artır.* M.Arif.

**İNTİBAH** *is.* [*ər.*] Oyanış, oyanma, canlanma, dirçəlmə, yenidən yüksəliş. *Azərbaycan ədəbiyyatının intibah dövrü. Milli intibah yolu.*

◊ **İntibah dövrü** *tar.* – XV–XVI əsrlərdə Avropada elm və incəsənətin çiçəklənməsi dövrü. *XVI əsrin axırıncı on ilində, intibah dövrünün sonunda İtaliyada meydana gəlmiş ilk opera əsərləri üçün müəlliflər xüsusi instrumental müqəddimə bəstələməzdilər.* Ə.Bədəlbəyli.

**İNTİBAHNAMƏ** *is.* [*ər.* intibah və *fars.* namə] Təbliği məzmunda olub, əksərən gizli çap edilərək kütlələr arasında yayılan vərəqə; bəyannamə. *İnqilabi intibahnamə. – Nəsir .. bolşevik intibahnaməsi çap etdiyi üçün həbsxanada yatırdı.* S.Hüseyn. *..İntibahnamələr .. çar hakimiyyətinə, burjuaziyaya qarşı mübarizəyə qalxmış fəhlə sinfinin iradəsini .. möhkəmlədirdi.* M.Hüseyn. [Dəmir Ataşa:] *Gətirdiyim intibahnamələri .. yayaq, camaat öz firqəsinin səsini eşitsin.* Ə.Vəliyev.

**İNTİHA** bax **intəha**. *Əmaninin dilrübası; Əzəldən rəhnüması; İntihayi-müddəası;*

*Sənsən canımın cananı.* Əmani. [Xacə] *qəziyyəni ibtidadan intihayədək Yusif şaha nəql etdi.* M.F.Axundzadə.

**İNTİHAR** *is.* [*ər.*] Özünü öldürmə. [Zəmanə] *..o qədər o biçarəni əzdi ki, axırda onu ya intihara, ya qara torpaq altına girməyə məcbur etdi.* C.Cabbarlı. *İndi onun simasında intihara qərar vermiş kimi küt bir durğunluq vardı.* Mir Cəlal. ☐ **İntihar etmək** – özünü öldürmək. *Yar-yoldaşlarından ar edəcək; Bəlkə axırda intihar edəcək.* A.Səhhət. [Zeynal:] *Mən intihar etmək ərəfəsindəyəm.* S.Hüseyn. [Münəvvər:] *Mənim əməlim yarımçıq qaldığı üçün dünyada qalmağı istəmirəm, bu dərdlər məni öldürəcəkdir, yainki intihar edəcəyəm.* M.S.Ordubadi.

**İNTİXAB** *is.* [*ər.*] Seçmə, seçib ayırma. [Qoca:] *..Hökmdar intixabında da atanın iştirakı və meyli təqdis olunardı.* Çəmənzəminli. [Səmirə:] *Məni bu saat ən çox həyəcanlandıran başqa bir şeydir: müvazinətini itirib, intixabında yanılmayasan.* M.Hüseyn. ☐ **İntixab etmək (eləmək)** – seçmək. [Cəmilə] *özünə həyat yoldaşı intixab etmək ərəfəsində idi.* S.Hüseyn. *C.Məmmədquluzadə böyük rus komedioqrafını şüurlu olaraq özünə müəllim intixab etmişdi.* M.İbrahimov. **İntixab olunmaq (edilmək)** – seçilmək. *Bəzi də, heç bir sənətin sahibi olmayıb, camaat arasında gəzən və camaat içində bəzi məmuriyyətlərə intixab olunmaq axtaran şəxslərdir.* C.Məmmədquluzadə. *Nümayəndələr intixab olunduğu zaman Fəxrəddin də nümayəndə heyətinin sədri seçildi.* M.S.Ordubadi.

**İNTİQAL** *is.* [*ər.*] 1. Bir yerdən başqa yerə keçmə, yerini dəyişmə. ☐ **İntiqal etmək** – köçmək, başqa yerə keçmək, yerini dəyişmək. [Çopo:] *Zatən ənənə nəsillərdən intiqal etmiş kollektiv bir ağıl deyilmi?* Çəmənzəminli.

2. Mexanizmlərdə: açma əməliyyatını yerinə yetirən xüsusi qurğu.

**İNTİQAM** *is.* [*ər.*] Özünə pislik edənə pislik etmə arzusu və işi; qisas, qisas alma, heyif alma, əvəzə əvəz; öc. [İsmət:] *Ah, fəqət intiqam dilərsə Orxan; İsmət xoşbəxt ikən olur bağrı qan.* H.Cavid. *Eşqin intiqamı yaşar hər zaman..* S.Vurğun. *Bu ki faciədir... faciəmizi; Niyə çevirmirik intiqama biz?* B.Vahabzadə. ☐ **İntiqam almaq (çəkmək)** – heyfini almaq. [Molla Xəlil] *aradığını bulmuş, müəllimdən yaxşı intiqam alacaqdı.* S.Hüseyn. [Şeyda:] *İnan ki, əfv etmək intiqam almaqdan daha müdhişdir.* H.Cavid. [Ovçu anasına:] *Mövhumat çəngəlində mənə olan sevgilimin intiqamını almalıyam.* Ə.Məmmədxanlı. **İntiqamını yerdə qoymamaq** – intiqamını almaq, əvəzini çıxmaq.

**İNTİM** [*fr.*] *kit.* 1. Dəruni, içdən gələn, səmimi. *İntim lirika yenə qüvvətli vətənpərvərlik motivləri ilə çarpazlaşır.* M.Hüseyn. *Füzulinin intim duyğuları tərənnüm edən şeirlərində də, lirikasında da zəmanəsinin ruhu, fəlsəfəsi, əxlaqi görüşü və təsəvvürləri əks etmişdir.* M.İbrahimov.

2. Gizli, məhrəmanə. [Tahirə] *elə gəlirdi ki, sevgilisi öz narazılığını yalnız intim bir şəraitdə söyləyəcək və Tahirdən ciddi bir haqq-hesab almamış əl çəkməyəcək.* M.Hüseyn.

**İNTİŞAR** *is.* [*ər.*] Yayma, yayılma. *Amma* [nə] *hasil mənim bu yazdığım mətalibdən ki, onların intişarı mümkün deyil.* M.F.Axundzadə. // Nəşr olunma, çıxma, çap edilmə. *"Molla Nəsrəddin" məcmuəsi 1906-cı ildən intişara başladı.* ☐ **İntişar etdirmək** – yaymaq. *Əjdərlə .. bu çap olunmuş ədəbiyyatı intişar etdirmək işində əsas rolu oynayırdı.* S.Rəhman. **İntişar etmək** – yayılmaq. *Əziz balalar! ..Məktəb vasitəsilə öyrəndigimiz elmləri, fənləri insanlar arasında intişar etmək fikrində bulunduq.* N.Nərimanov. *Onun* [akasiyanın] *açmış ağ çiçəklərindən xoş bir iy intişar edirdi.* S.Hüseyn. *Xalq musiqi yaradıcılığının ən çox intişar edən janrı mahnılardır.* Ə.Bədəlbəyli.

**İNTİZAM** *is.* [*ər.*] 1. Nizam və qayda, səliqə, tərtib. [Yemək odasında] *evini və ailəsini sevən bir qadın intizam və səliqəsi müşahidə edilirdi.* S.Hüseyn. [Oğlan:] *Bizim evimizdə intizam və ölçü altına girə biləcək heç bir şey yoxdur.* M.S.Ordubadi. ☐ **İntizama salmaq** – nizama salmaq, qaydaya salmaq, səliqəyə salmaq.

2. Hər hansı bir kollektivin bütün üzvlərinin tabe olması məcburi olan möhkəm

qayda, qanun; nizam. *Əmək intizamı. Hərbi intizam. Şüurlu intizam tərbiyəsində inandırma üsulu böyük rol oynayır. – ..Məktəb öz intizamı, dərs keyfiyyəti, ictimai, faydalı işləri ilə şöhrət qazanmağa başladı.* S.Rəhimov. [Müəllim Fərmana dedi:] *Əgər orduya alınan gənclər sizin kimi düşünsə, orduda intizam ola bilərmi?* Ə.Sadıq. ☐ **İntizama salmaq** – nizam və intizama tabe etmək. [Çopo:] *Bunları* [iskitləri] *yalnız igid bir sərkərdə intizama sala bilər.* Çəmənzəminli.

**İNTİZAMLI** *sif.* İntizama ciddi surətdə riayət edən, qayda və qanuna əməl edən. *İntizamlı şagird. İntizamlı işçi. İntizamlı döyüşçü.*

**İNTİZAMLILIQ** *is.* İntizamlı olma, nizam və intizamı gözləmə.

**İNTİZAMSIZ** *sif.* 1. İntizama, qayda-qanuna riayət etməyən. *İntizamsız işçi. İntizamsız şagird.* – [Qoşqar:] *Bilirsiniz ki, mən intizamsız adam deyiləm..* İ.Hüseynov.

2. Qayda-qanunsuz, tərtibsiz, nizamsız, pozuq, qarmaqarışıq. *İntizamsız qoşun.*

**İNTİZAMSIZLIQ** *is.* 1. Nizam və intizamın olmadığı hal, nizam və intizama riayət etməmə. *Ən geridə qalan bu bölüyün zəif cəhətləri intizamsızlıq, qeyri-mütəşəkkillikdir.*

2. Qarmaqarışıqlıq, tərtibsizlik, səliqəsizlik, nizam və qayda olmaması.

**İNTİZAR** *is.* [*ər.*] Həsrət içərisində gözləmə, səbirsizliklə gözləmə. *Neçə rəfiqi-müvafiqlə əlləşib içə mey; Nə kəsri-məclisi-meydən, nə intizarı ola.* S.Ə.Şirvani. *On beş gün ayrılıq on beş il keçdi; Öldürdü intizar, gözüm yoldadır.* Ə.Cavad. *İntizar və səbirsizlik yenidən başlandı.* Qantəmir. *Qurtardı həsrət də, xoş intizar da.* B.Vahabzadə. ☐ **İntizar çəkmək** – b a x **intizar qalmaq**. *Aşıq saza nə qaldı? Ərzəm yazana qaldı; Bülbül intizar çəkər; Görək yaza nə qaldı?* (Bayatı). *Tülui-mahtab üçün çəkərdim; Dəmadəmdən gecə çox intizarı.* Əmani. *Adamlar bu saat nəsə bir şey olacaq gümanı ilə intizar çəkirdilər.* Mir Cəlal. // Gözləmək. *Dağlara çıxmağa həkim qoymayır; İntizar çəkməsin dağ çiçəkləri.* N.Rəfibəyli. **İntizar qalmaq** – nigaran olmaq, nigarançılıqla gözləmək. [Sara Bəhrama:] *Bilmirsənmi ki, əmin qızı sənsiz darıxır, həm də intizar qalmışdım.* C.Cabbarlı. **İntizar qoymaq** – gözləməyə məcbur etmək, nigaran qoymaq, gözlətmək. *Zülfün tök belə, dilbər; Tumar çək telə, dilbər; Yetər intizar qoydun; Dolan gəl belə, dilbər.* (Bayatı). *Dedin ki, qoymaram aləmdə intizar səni.* S.Ə.Şirvani. **İntizar olmaq** – b a x **intizar qalmaq**. *Oldular intizar bir saat yarım.* H.K.Sanılı. **İntizara yetməmək** – intizarını çəkdiyini görə bilməmək. *Ölürəm qəlbimdə yar nişanası; Gözüm yolda intizara yetmədi.* Aşıq Ələsgər. **İntizardan qurtarmaq** – nigarançılıqdan qurtarmaq, arzusu yerinə yetmək, rahatlanmaq. *Bayatı səsi içəri dolanda Pərşan intizardan qurtarmış kimi dərindən sinəsini ötürdü.* M.İbrahimov. **İntizarında qalmaq, intizarını çəkmək** – birini həsrətlə, yaxud nigarançılıqla gözləmək. [Leyla:] *Bütün gün intizarında, gözüm həsrətdə qalmışdım.* Ü.Hacıbəyov. [Sultan:] *Dünyada şad xəbərin intizarını çəkməkdən böyük zövq ola bilməz, qardaşoğlu!* İ.Hüseynov.

**İNTİZARÇILIQ** *is. dan.* Səbirsizliklə gözləmə, intizar çəkmə, gözü yolda qalma; nigarançılıq.

**İNTİZARLI** *sif. şair.* Həsrətli, nigaran, intizarla dolu, intizar ifadə edən. *Göyərib bağça, nanə; Bağ nanə, bağça nanə; İntizarlı gözlərim; Doyunca bax canana!* (Bayatı). *Məsmə arvadın başında intizarlı fikirlər bir-birini təqib edirdi.* Mir Cəlal. *İntizarlı dəqiqələr zindandan ağır, illərdən uzun olsa da, başa çatırdı.* B.Bayramov.

**İNTONÁSİYA** *is.* [*lat.*] *dilç.* 1. Səs tonunun ucalıb-alçalması; ton, tələffüz xüsusiyyəti.

2. Musiqi alətində çalarkən, yaxud oxuyarkən tonun düzgün və ya yanlış səslənməsi.

**İNTRÍQA** [*fr.*] 1. Bir məqsədə (adətən pis məqsədə) yetmək üçün əlaltından görülən iş; hiylə, fitnə. *İntriqa aparmaq. İntriqa qurbanı. – ..Təbriz şəhəri irticanın və siyasi intriqaların mərkəzinə çevrildi.* M.S.Ordubadi. [Tələbə:] *Bir də, mən intriqa bilən adam deyiləm..* Qantəmir. [Yusif:] *Deyirlər, sədrin əleyhinə intriqa düzəldirsən.* B.Bayramov.

2. *ədəb.* Roman və ya dramda əsas hadisələrin çox dolaşıqlığı və gərginliyi cəhətdən fərqlənən süjet xətti, mövzunun düyünü.

**İNTRİQÁN, İNTRİQAÇI** *is.* İntriqa ilə məşğul olan adam. *İntriqanın biridir.*

**İNTUÍSİYA** [*lat.*] 1. Bir şeyin mahiyyətini incədən-incəyə duyma qabiliyyəti; duyğu.

2. Fəlsəfədə: varlığı təcrübə və məntiqi nəticələrin köməyi ilə deyil, bilavasitə anlama, dərk etmə qabiliyyəti. *İntuisiyanın psixoloji mexanizmi. Spinozanın fəlsəfəsində intuisiya böyük yer tutur.*

**İNVALÍD** [*lat.*] b a x **əlil**. *İnvalidlərin nümayəndəsi bilib ona tribunada yer vermişdilər.* Mir Cəlal.

**İNVAR** *is.* [*ing.*] Dəmir xəlitəsi.

**İNVARİÁNT** *is.* [*lat.*] Düşdüyü mühitdən asılı olmayan.

**İNVENTÁR** [*lat.*] 1. Bir müəssisəyə, idarəyə, təşkilata məxsus olan avadanlığın, ləvazimatın və s.-nin məcmusu. *Kənd təsərrüfatı inventarı. Xəstəxana inventarı. Zavod inventarı.*

2. Həmin ləvazimatın, avadanlığın siyahısı. *İnventar tərtib etmək. Kitabları inventara daxil etmək.*

◊ **Canlı inventar** – mal-qara. **Cansız inventar** – alətlər, nəqliyyat vasitələri, avadanlıq və s.

**İNVENTARİZÁSİYA** [*lat.*] Siyahıyaalma, siyahıyaalınma, inventara daxil etmə (edilmə). *İnventarizasiya siyahısı. İnventarizasiya komissiyası.* // Hər hansı müəssisəyə, idarəyə, təşkilata məxsus olan şeylərin yerində olub-olmadığını hesablama və siyahısını tutma yolu ilə yoxlanması. *Kitabxana fondunun inventarizasiyası.*

**İNVÉRSİYA** [*lat.*] *dilç. ədəb.* Qrammatik hadisə və ya üslubi üsul olaraq, cümlədə sözlərin adi sırasının dəyişdirilməsi.

**İNYÉKSİYA** [*lat.*] *tib.* Dəri altına iynə ilə dərman yeritmə.

**İNZİBATÇI** *is.* İdarə edən, idarə başçısı; özünə tabe olan idarə və ya müəssisədə yaxşı nizam və intizam yaratmış müdir. *Nəriman onu inzibatçı kimi tanımışdı.* Mir Cəlal. [Zakir] *yaxşı bir mühəndis olmaqla bərabər, yaxşı da inzibatçıdır.* H.Seyidbəyli. *İnzibatçı Qulam müəllimin xahişinə əməl etdi.* S.Rəhimov. // Məsul sərəncamçı.

**İNZİBATÇILIQ** *is.* Konkret rəhbərlik əvəzinə quru əmr və sərəncam verməklə idarə etmə. [Qəhrəman:] *Qəti surətdə inzibatçılığa, hay-küyə yol vermək olmaz.* Ə.Vəliyev.

**İNZİBATİ** *sif.* 1. Nizam-intizama aid olan, nizam və intizamı nəzərdə tutan qanunlara uyğun olan, bir idarənin intizam qanunlarına tabe edilən. *İnzibati tədbirlər. İnzibati cəza.* □ **İnzibati yolla** *hüq.* – icra orqanlarının sərəncamı ilə. *İnzibati yolla cəzalandırmaq. İnzibati yolla sürgün etmək. İnzibati yolla cərimələndirmək.*

2. İdarə sisteminə, icraedici hökumət orqanlarına aid olan. *İnzibati idarələr. İnzibati mərkəz. İnzibati xəritə. İnzibati vahid. – Şərur və İrəvan qəzaları inzibati idarələri şikayətlə dolu idi.* E.Sultanov.

◊ **İnzibati hüquq** – daxili idarə sahəsində dövlət fəaliyyətinin qayda və üsullarını müəyyən edən hüquq normaları.

**İNZİVA** *is.* [*ər.*] *klas.* Xəlvət bir yerə çəkilib adamlardan uzaqlaşma, xarici aləmlə əlaqəsini kəsmə. □ **İnzivaya çəkilmək** – bir guşəyə çəkilib, dünya ilə əlaqəsini kəsmək. [Süleyman] *deyərdi ki, rəvayətə görə, .. onun övladından biri başını götürüb qaçmış.. Bu Abşeronda, sahildə, qayalıqlarda inzivaya çəkilmiş. Hər kəsdən uzaq həyat sürmüş və ölmüşdür.* Ə.Məmmədxanlı. *Onun sonsuz dərdləri yetişmədi davaya; O qayıdıb evinə çəkildi inzivaya.* B.Vahabzadə.

**İÓN** *is.* [*yun.*] *fiz.* Elektriklə yüklənmiş atom və ya atom qrupu.

**İONİZÁSİYA** [*yun.*] b a x **ionlaşma** və **ionlaşdırma**.

**İONLAŞDIRICI** *sif. fiz.* İon əmələ gətirən, ionun meydana gəlməsinə səbəb olan. *İonlaşdırıcı amil.*

**İONLAŞDIRILMA** "İonlaşdırılmaq"dan *f.is.* *..Havanın süni ionlaşdırılmasına, ondan profilaktika və müalicə məqsədləri üçün istifadə olunmasına maraq artmışdı.* (Qəzetlərdən).

**İONLAŞDIRILMAQ** *məch. fiz.* İon əmələ gətirilmək.

**İONLAŞDIRMA** "İonlaşdırmaq"dan *f.is.*

**İONLAŞDIRMAQ** *f. fiz.* İon əmələ gətirmək, ion doğurmaq, ion törətmək. *Qazı ionlaşdırmaq. Havanı ionlaşdırmaq.*

**İONLAŞMA** *is. fiz.* Hər hansı mühitdə ionların meydana gəlməsi. *Qazların ionlaşması.*

**İONLU** *sif. fiz.* İonu olan. *İonlu reaksiya.*

**İP** *is.* 1. Uzun pambıq, kətan, yun və s. liflərindən eşilib hazırlanan və əsasən bağ kimi işlədilən məmul. *İplə bağlamaq. Tayları iplə sarımaq.* – [Ağa:] *Gördüm yeşiyin ipi qırılıb. Molla Nəbiqulu yeşiklə bərabər ağacdan uçub, düşüb Qasımın otağının üstünə.* Ə.Haqverdiyev. // *məc.* Buxov, cidar, əl-ayağı bağlayan şey mənasında. [Koroğlu dedi:] *Qırılar zəncirlər, iplər; Nər atılar meydana indi.* “Koroğlu”.

2. Pambıq iplikdən toxunmuş. *Çarıq bağlarından, uzunboğaz rəngli ip corablarından bəlli idi ki, ananın əzizidir.* Mir Cəlal. □ **İp vurmaq** – toxumaq (iplə). *Torun ipini vurmaq. Corab ipi vurmaq. – Ömrünü susmaq və başını aşağı salaraq məkik atmaqla, ip vurmaqla keçirən şərbaflar və muzdurlar yavaş-yavaş səsini qaldırıb “urreyy” çığırdı.* Ə.Əbülhəsən.

◊ **İpə (ipə-sapa) yatmamaq (gəlməmək)** – heç bir nəsihət götürməyən, söz eşitməyən, yaxud heç bir nizam və intizama uyuşmayan adam haqqında. *Padşah nə qədər dəlil-dəlalət elədi, Qəmər ipə-sapa gəlmədi ki, gəlmədi.* (Nağıl). *Uşaq oynayar, gülər; Xəstə deyilsə əgər; Bəzisi sakit olar; Bəzisi ipə yatmaz.* R.Rza. **İpə-sapa düzmək (düzülmək)** – fikrin, sözlərin düzgün, səlis, rəvan ifadə edilməsi haqqında. *Fikirlər cərgə-cərgə ipə-sapa düzüldü; O, iztirab əlində üzüldükcə, üzüldü.* B.Vahabzadə. **İpə-sapa yatmaq (gəlmək)** – yola gəlmək, söz eşitmək, nəsihət qəbul etmək. [Hümmətyar:] [Xanpəri] *ancaq iki ildir daha o adam deyildir. İndi, necə deyərlər, ipə-sapa yatır.* Ə.Vəliyev. **...ipinə (ipinin üstünə) odun yığmaq olmaz** – etibarsız, sözünün üstündə durmayan, mütərəddid adam haqqında. *Xan Fətəlinin adını eşitcək təkrar qəzəbləndi: – Onun sözünü danışma! – dedi, – onun ipinin üstünə odun yığmaq olmaz!* Çəmənzəminli. **İpini boşaltmaq (buraxmaq)** – sərbəstlik vermək, pis hərəkətlərinə göz yummaq, qabağını almamaq, başlı-başına buraxmaq. *Uşağın ipini lap boşaltmısan ha.* **İpini çəkmək (yığmaq, yığışdırmaq)** – pis yoldan, pis əməldən qaytarmaq, qabağını almaq, həddini göstərmək, intizama çağırmaq. [İmamzadə:] *Sən bunların ipini yığışdıra bilməsən, hər cür xata baş verə bilər.* Q.İlkin. **Boğazına ip salmaq** – boğub öldürmək. *İslamın fikrinə gəlmişdi ki, Tellini xoş dillə alıb qışlağa gətirsin, sonra bir gecə boğazına ip salıb boğsun.* S.Hüseyn.

**İPÇİN** b a x **ifçin**.

**İPƏK** 1. *is.* Tut yarpaqları ilə bəslənən barama qurdlarının əmələ gətirdiyi çox incə və parlaq tellər və bu tellərdən toxunan qiymətli parçalar. [Əsgər:] *Çit, ipək, məxmər, bafta, tafta – hər şeyim var.* Ü.Hacıbəyov. *Bir yığın tüllərə və ipəklərə bürünmüş qızlar gələr, oynarlar.* H.Cavid. *Buranın* [Çalusun] *bollu düyüsü və məşhur ipəyi vardır.* M.İbrahimov.

2. *Sif. mənasında.* İpəkdən hazırlanmış, ipəkdən tikilmiş (toxunmuş). *İpək paltar. İpək köynək. İpək pərdə. – Onlar ipək xalçalar döşənmiş aynalı pilləkənlərdən yuxarı çıxıb .. böyük salona girdilər.* M.S.Ordubadi. *Nazlı əynindəki tünd-şabalıd rəngli ipək köynəyini çıxartdı..* S.Rəhman.

◊ **İpək kimi** – 1) çox incə, parlaq, yumşaq. *İpək kimi saçları var. – Tüklərindir ipək kimi parlaq; Bədnəzərdən vücudun olsun iraq!* M.Ə.Sabir. *Of, nə yamandır o süzgün baxışlar; Ey ipək telləri zərəfşan gəlin!* H.Cavid; 2) *məc.* mülayim, xoşrəftarlı, yumşaq. *İpək kimi xasiyyət. – Deyir Məşədi bəy, alnında vüqar; Onun ipək kimi təbiəti var!* S.Vurğun.

**İPƏKAÇAN** b a x **ipəkəyirən**. *İpəkaçan zavodlarda əvvəlcə baramaların üzərində olan tiftikləri, sonra isə nazik ucları ayırırlar.* “Əmtəəşünaslıq”. [Qonça:] *Rəştdə ipəkaçan dəzgahımız vardı.* S.Hüseyn.

**İPƏKÇİ** 1. *is.* İpəkçilik mütəxəssisi, baramaçılıq mütəxəssisi; baramaçı.

2. *köhn.* İpək satan, ipək taciri. *Bakıda iri ticarətlə məşğul olan düyüçülər, xalçaçılar, ipəkçilər .. də az deyildi.* H.Sarabski.

3. *Sif. mənasında.* Barama yetişdirməklə məşğul olan, baramaçı. *İpəkçi təsərrüfat.*

**İPƏKÇİLİK** *is.* 1. Barama qurdundan ipək hasil etmə işi; baramaçılıq. *İpəkçiliklə məşğul olmaq.* – [Qonça:] [Ataş] *ipəkçiliklə məşğul olurdu.* S.Hüseyn. *Burada* [Rəştdə] *ipəkçilik geniş yayılmışdır.* M.İbrahimov.

2. Bu işlə məşğul olan təsərrüfat. *İpəkçilik təsərrüfatı.*

**İPƏKƏYİRƏN** *sif.* İpəyi açan, ayıran, təmizləyən. *İpəkəyirən maşın.*

**İPƏKXANA** *is. köhn.* İpək karxanası, ipək emalatxanası.

**İPƏKQURDU** b a x **baramaqurdu**. *İpəkqurduları böyüyüb yaşa çatdıqdan sonra, ipək sarımaq üçün tel buraxmağa başlayırlar.* A.Quliyev.

**İPƏKLİ** *sif.* İpək qarışığı olan, içərisində ipək olan. *İpəkli parça.*

**İPƏKTOXUYAN** *sif.* İpəkdən parça toxuyan. *İpəktoxuyan maşın.* – *..İpəktoxuyan kombinatda yüzlərlə ixtisaslı fəhlə çalışır.* S.Rəhman.

**İPƏYATMAZ** *sif.* və *is.* Heç bir üsul və qaydaya, nizam və intizama uyuşmayan, heç bir nəsihət və söz qəbul etməyən (adam), tərs (adam).

**İPƏYATMA(MA)ZLIQ** *is.* İpəyatmaz adamın hal və keyfiyyəti; tərslik.

**İPƏYİRƏN** *sif.* İpi açıb təmizləyən və əyirən. *İpəyirən maşın.*

**İPLƏMƏ** 1. *is. dan.* Dəlisov, dəlibaş, dəli. *İpləmənin biridir. O, lap ipləmə imiş.* // *Sif. mənasında.* Zəncirlə, iplə bağlanmalı olan; zəncirləmə. *İpləmə dəli.*

2. "İpləmək"dən *f.is.*

**İPLƏMƏK** *f.* İplə bağlamaq, iplə sarımaq. *Yükü ipləmək. Yeşiyi ipləmək.*

**İPLİK** *is.* 1. Pambıq lifindən hazırlanan möhkəm, davamlı sap. *Pambıq iplik.* – *Uşağın iki əlinin baş barmaqlarını iplik ilə bir-birinə bağlayıb sonra ipliyi kəsirlər.* Ə.Haqverdiyev. [Ayna:] *Budur, boyatmaq üçün iplik aparıram.* Ə.Məmmədxanlı.

2. *Sif. mənasında.* Həmin sapdan toxunmuş, hazırlanmış. *İplik tor.* – *Ala iplik çuvalları heç kəs tanımır, hamı mat qalıb çiynini çəkirdi.* B.Bayramov.

◊ **İplik kimi dolaşmaq** – qarışmaq, bir-birinin içinə keçmək. *Hatəm dayı .. təpələr arasında iplik kimi dolaşıq düşən cığırlara baxırdı.* Mir Cəlal.

**İPLİKXANA** *is.* İplik karxanası, iplik fabriki.

**İPLİKLİ** *sif.* Xalis yun deyil, iplik qarışığı olan, iplik qarışıq toxunmuş. *İplikli parça.*

**İPOTEKA** *is.* Müavinət, girov qoyulmuş əmlak.

**İPPODRÓM** *is.* [*yun.*] Cıdır meydanı.

**İPRƏNMƏK** *f.* İyrənmək, kiməsə, nəyəsə nifrət etmə.

**İPRİT** [Belçikada İprit şəhərinin adından] *kim.* Xardal qoxuyan zəhərli qaz; dəridə irinli yara əmələ gətirən və orqanizmi bütünlüklə zəhərləyən davamlı zəhərləyici maddələrdən biri.

**İPSİZ** *sif.* 1. Başına ip salınmamış, başı iplə bağlanmamış, açıq buraxılmış.

2. *məc. dan.* Öz hərəkətlərində hədd-hüdud bilməyən qaba, qanmaz adam haqqında. *İpsizin biridir.*

**İPVARİ** *sif.* İpə oxşar, ip kimi.

**İRAD**[1] *is.* [*ər.*] Söyləmə, demə, danışma. □ **İrad eləmək (etmək)** – demək, söyləmək. *İngiltərə vaizi Ser Deterdinq öz moizələrinin birində irad edirmiş ki, dünyada neft iki qisimdir.* C.Məmmədquluzadə. [Xarrat:] *Əfəndim, irad etdiyim bu sözlər xilafi-həqiqət ki deyildir?* T.Ş.Simurq. [Kərəmov:] *Orada nitq irad elədi, qəzetə düşdü, indi də budur, qayıdır, deməli, təzədən düşəcəyik işə.* S.Rəhman.

**İRAD**[2] *is.* [*ər.*] Nöqsan, kəsir, eyib, qüsur. □ **İrad eləmək (tutmaq, saymaq)** – nöqsan tutmaq, kəsrini, eybini demək. *Hicran edibdi könlümü bərbad, ağlaram; Çoxlar tutar bu halıma irad, ağlaram.* X.Natəvan. *..Böyüklərə irad tutmaq özü bir xatadır.* C.Məmmədquluzadə. *Dilara .. gülə-gülə anasına irad tutmuşdu..* M.İbrahimov.

**İRADCIL** *sif.* Hər şeyə irad tutmağı, irad tapmağı sevən. *İradcıl adam.*

**İRADÇI** *sif.* Hər şeyə irad tutan, hər şeydə bir nöqsan, eyib, qüsur tapmağa çalışan. *İradçı adam.*

**İRADÇILIQ** *is.* Hər şeydə irad tutma, hər şeydə bir nöqsan, eyib, qüsur tapmağa çalışma.

**İRADƏ** *is.* [*ər.*] 1. İnsan psixikasının, insanın öz qarşısına qoyduğu məqsədə nail olmaq, arzu və istəklərini həyata keçirmək qabiliyyətində təzahür edən xüsusiyyətlərindən biri. *İradə qüvvəsi. İradə zəifliyi.* – [Doktor:] *..Hər çətinliyi ortadan qaldıran iradədir.* A.Şaiq. *Min bir əzaba dözdün,*

*iradən sarsılmadı; Qəlbindən hicran yükü daş kimi asılmadı.* S.Rüstəm. *Əjdər Mirzə Hüseynin sözlərində böyük iradə və inam olduğunu hiss edirdi.* S.Rəhman. // Bir şeyi əldə etmək üçün göstərilən səy, cəhd, qeyrət, inad. [Səbirə:] *Birdən zərfi əlimdə gördüm. Qaytarmağa iradəm çatmadı.* M.Hüseyn.

2. İstək, arzu, könül, tələb. *İradəsini yerinə yetirmək.*

3. *köhn.* Əmr, hökm, fərman. // Niyyət, məram. [Vəzir:] *A kişi, padşahın iradəsi budur ki, sənin qızını alsın, razısanmı?* Ü.Hacıbəyov. □ **İradə etmək (buyurmaq)** *köhn.* – əmr vermək, hökm etmək, buyurmaq. *Pəs o biri rəfiq iradə etdi ki, daxil olsun, onun da halı bu qərar ilə oldu.* M.F.Axundzadə.

**İRADƏLİ** *sif.* Möhkəm iradəyə, xarakterə sahib olan (bax **iradə** 1-ci mənada). *İradəli oğlan.* – [Günəş] *nəzakətli, ciddi və iradəli bir qadın olmuşdu.* A.Şaiq. *Zeynəb .. ədəbiyyatımızda yaranmış iradəli qadın surətlərindəndir.* M.İbrahimov. *Həcər qızının möhkəm iradəli olduğunu bilirdi.* Ə.Vəliyev.

**İRADƏLİLİK** *is.* Möhkəm iradəyə malik olma, iradəcə möhkəmlik; səbatlılıq.

**İRADƏSİZ** *sif.* İradəsi olmayan, iradəsi zəif, qətiyyətsiz. *Zeynal iradəsiz bir gəncdi.* S.Hüseyn.

**İRADƏSİZLİK** *is.* İradəsi olmayan adamın hal və keyfiyyəti; iradə zəifliyi, qətiyyətsizlik. *Toğrul artıq hökumət işlərindəki dəyərsizliyini və həddindən artıq zəiflik və iradəsizliyini göstərdi.* M.S.Ordubadi. [Mahmud] *iradəsizlik etsə, özünü məhv edə bilər.* Z.Xəlil.

**İRADƏT** [*ər.*] *klas.* Arzu, istək, könüldən gələn razılıq. *Öz iradəti ilə* (öz razılığı ilə). – *Hüsn afəti-eşq olub dəmadəm; Gəldikcə iradət oldu möhkəm.* Füzuli. *Durmuşam eyni iradətlə yenə; Baxıram kuyinə həsrətlə yenə.* M.Ə.Sabir. [Mirzə Bəylər:] *Bir az məhəbbətə sədaqətim var; Şövq ilə həvəsə iradətim var.* Aşıq Ələsgər.

**İRADİ** *sif.* İradəyə aid, iradədən asılı olan, iradə ilə bağlı olan; ixtiyari. *İradi hərəkət.*

**İRADSIZ** *sif.* Heç bir iradı, nöqsanı olmayan; nöqsansız, qüsursuz, eyibsiz. *İradsız iş. İradsız əsər. İradsız adam olmaz.*

**İRADSIZLIQ** *is.* Nöqsansızlıq, qüsursuzluq, eyibsizlik.

**İRAQ** *zərf* Uzaq, uzaqda. *İraq olmaq. İraq durmaq.* – *Gül əkdim, şaxta vurdu; Nə yaman vaxtda vurdu; Bimürvət ovçu məni; Yardan iraqda vurdu.* (Bayatı). *Mürği-ruhum getməz səndən irağa.* Aşıq Ələsgər. □ **İraq düşmək** – uzaq düşmək, ayrılmaq, uzaqda olmaq. [Bahadır] *gördü ki, Sonadan xeyli iraq düşübdür.* N.Nərimanov. **İraq eləmək** – uzaqlaşdırmaq, uzaq eləmək. *Çıxardaq məmləkətdən; Ölkədən iraq eyləyək!* Aşıq Ələsgər. **İraq olmaq** – uzaq olmaq, uzaq düşmək. *Elə bilsin padşahi-zamandır; Hər kim iraq olur, müxtəsər, səndən.* Q.Zakir. *Müddətdi gözümdən olubdu iraq; Əridib ürəyim dərdü qəm, fəraq.* Aşıq Ələsgər. *Gözümdən bir an da iraq olmadın; Mən sənə hər yerdə Vətən deyirəm.* S.Rüstəm. // *sif.* Uzaq. *Uzaq ölkələrə, iraq ellərə; Axışan buludlar, axan buludlar!* N.Rəfibəyli. // *İs. mənasında.* Uzaq yer. *Yolum oldu iraqlar; Çiynim kəsdi yaraqlar; Ayrılıq məlum oldu; Mən ağlaram, yar ağlar.* (Bayatı). **İraq, iraq candan, iraq olsun** – uzaq olsun, Allah göstərməsin (qorxulu, zərərli, arzuedilməz bir şey, hadisə haqqında deyilir). [Gülsüm xala:] *Buy, bu nə sözdür deyirsən, a qadasın aldığım, iraq canından, Allah eləməsin ki, Şirin qiyamətə kimi yatsın..* E.Sultanov. [Səriyyə xala:] *İraq candan,* [uşaqlar] *dilənçiyə oxşayırdılar.* M.İbrahimov. [Kiçikxanım:] *Allah eləməsin, iraq candan! – deyə onun əlini sıxdı və tələsirmiş kimi ayrılıb getdi.* Mir Cəlal.

**İRAQLAŞDIRILMA** "İraqlaşdırılmaq"-dan *f.is.*

**İRAQLAŞDIRILMAQ** *məch.* Uzaqlaşdırılmaq.

**İRAQLAŞDIRMA** "İraqlaşdırmaq"dan *f.is.*

**İRAQLAŞDIRMAQ** *f.* Uzaqlaşdırmaq.

**İRAQLAŞMA** "İraqlaşmaq"dan *f.is.*

**İRAQLAŞMAQ** *f.* Uzaqlaşmaq.

**İRAQLIQ** *is.* Uzaqlıq, uzaqda olma. *Mənim qanıma girmə, ey pəri, kim; İraqlıqdan gözüm qan ağlar oldu.* Kişvəri.

**İRANLI** *is.* və *sif.* İran əhalisindən olan; İran vətəndaşı, İran təbəəsi.

**İRANŞÜNAS** *is.* [*fars.*] İranşünaslıq mütəxəssisi.

**İRANŞÜNASLIQ** *is.* İran dilləri və mədəniyyətini öyrənən elmlərin məcmusu; İran filologiyası.

**İRBİS** *is. zool.* Qar bəbiri, pişikkimilər fəsiləsindən məməli yırtıcı heyvan.

**İRÇAL** *dan.* bax **riçal**. *Armud irçalı .. indi istədiyin qədər taparsan.* Ə.Əbülhəsən.

**İRÇƏ** *is. məh.* Qəlib. *Zərgər irçəyi.*

**İRDƏLƏMƏK** *f. məh.* Təmizləmək, arıtmaq. *Taxılı irdələmək. Meyvəni irdələmək.*

**İRƏLİ** *zərf* 1. Hərəkətin istiqamətinə görə qabağa, qabaq tərəfə (*geri* əksi). *İrəli yerimək. İrəliyə addımlamaq. İrəli çıxmaq. İrəli sürmək. – Qaraca qız isə irəli gəlib öz dostunun zəhərlənmiş qanını sorur.* S.S.Axundov. *Kəhər yerindən dördnala sıçrayıb dırnağının altından palçıq topaları səpələyə-səpələyə irəli cumdu.* M.İbrahimov. ☐ **İrəli vermək** – 1) qabağa vermək, qabağa uzatmaq. *Tüfəngi irəli vermək;* 2) qabağa itələmək, qabağa çıxartmaq. *Uşağı irəli verdim.* // *Sif. mənasında.* Qabaq, ön. *Məktəbin irəli tərəfi güllükdür.* // **İrəlidəki** şəklində – öndə olan, qabaqda olan. *İrəlidəki dəstə sürətlə qaçırdı.* // Qabaq tərəfə, qabağa (bəzən **irəliyə** şəklində). *Ürkə tövşüyə-tövşüyə su içmək üçün başını irəli uzadanda silah səsindən diksinib qulaqlarını şəklədi.* M.Hüseyn. *Sal daşının dibindən irəliyə bir qoşalülə çıxmışdı..* M.İbrahimov. *Qırmızı alov irəli hücum edir, pəncələnmiş buğda dərzlərini yandırıb məhv edirdi.* Ə.Vəliyev. // **İrəlidən** şəklində – qabaqdan, öndən, qarşıdan. *İrəlidən arıq tülküyə bənzəyən alış-verişçilər qaban kimi gümrahlanıb don-don donquldanırdılar.* E.Sultanov.

2. Əvvəl, qabaq. *Fərəhimdən ölərəm gər səni birdən görsəm; Gəlməyindən irəli eylə xəbərdar məni.* S.Ə.Şirvani. [Allahqulu:] *O məndən bir-iki saat irəli gəlibdir.* N.Vəzirov. // Tez. *Hamıdan irəli gəldi.* ☐ **Bundan irəli** – 1) ...əvvəl, ...qabaq. *Yetmiş il bundan irəli bina olunan Naxçıvan hamamlarının xəzinəsinin suyu yeddi ildə bir dəyişilir.* C.Məmmədquluzadə. *İndiki işləri görəndə on bir il bundan irəli olan bu əhvalat yadıma düşür..* Qantəmir; 2) keçmişdə, keçmiş zamanda, əvvəllər, qabaqlar. *Bundan irəli arvadlar ərləri ilə fəxr edirdilər.* Ə.Vəliyev. // **İrəlilər, irəlilərdə** şəklində – keçmişdə, qabaqlar, əvvəllər. [Qurban:] *Qarı nənə, bayaq dedim, irəlilər ar eləyirdim.* Ə.Haqverdiyev. [Cahangir ağa:] *İrəlilərdə mən də sənin kimi eşitmişdim.* S.S.Axundov.

3. **İrəlini** şəklində – gələcəyi, sonranı, qabağı, gələcək zamanı (dövrü, şəraiti və s.-ni). *İrəlini nəzərə almaq. İrəlini düşünmək. Rəhbərlik etmək üçün irəlini görmək lazımdır.* // **İrəlidə** şəklində – 1) qabaqda, öndə, qarşıda; 2) qabaqda, sonra. *Bu xüsusda söhbət irəlidə gedəcəkdir. – İrəlidə Mərdəkanın işıqları fərq edilirdi.* S.Hüseyn. *Birinci gün olduğu kimi yenə də Cavad irəlidə gedir, döyüşçüləri ruhlandırırdı.* Ə.Vəliyev. // Gələcəkdə, qarşıda. *İrəlidə Səmədi tamamilə yeni bir həyat, yeni işlər, yeni qayğılar gözləyirdi.*

◊ **İrəli atmaq** – ortalığa atmaq, irəli sürmək, müzakirəyə qoymaq. *Onu gözəl tanıyır və həmişə qabaqda getdiyini, yeni təşəbbüslər irəli atdığını yaxşı bilirdilər.* **İrəli düşmək** – 1) bir işdən qazanc əldə etmək, xeyir görmək, mənfəət götürmək. *Hacı Sultan isə yalnız daşgərdişindən gündə qırx-əlli pud irəli düşürdü.* S.Hüseyn; 2) başqasından daha tez hərəkət etmək, müvəffəqiyyət əldə etmək, qabaqlamaq. *O, məndən irəli düşdü.* **İrəli çəkilmək** – başqalarının arasından seçilib daha məsul işə, vəzifəyə təyin edilmək. [Sara] *xalq məhkəməsində bir il qulluq etdi, irəli çəkildi.* Mir Cəlal. **İrəli çəkmək** – 1) başqalarının arasından seçib daha məsul işə, vəzifəyə qoymaq. *Onu məktəb müdiri vəzifəsinə irəli çəkmişdilər;* 2) ortaya atmaq, irəli atmaq. *Müəllim Tellinin irəli çəkdiyi şəriət məsələsini təhlil etmək istəyirdi.* S.Hüseyn. **İrəli getmək** – 1) irəliləmək; 2) daha mütərəqqi fikirlər irəli sürmək. *C.Məmmədquluzadə bəzi ictimai hadisələrin anlayışında çox irəli gedir.* M.İbrahimov; 3) inkişaf etmək, tərəqqi etmək, artmaq. [Bədirnisə:] *Bu, çox yaxşı qızdır. Kənddə qadınların irəli getməyinə çox can yandırandır.* Mir Cəlal. [Məmməd:] *Sən təsəvvür edirsənmi, beş-on ilin içərisində elm nə qədər irəli gedib?* Ə.Əbülhəsən. **İrəli gəlmək** – 1) əmələ gəlmək, yaxşılaşmaq, düzəlmək. *Uşaq günbə-*

*gün irəli gəlir.* – [Baloğlan:] *Daha bal da yesə, irəli gəlməz.* C.Cabbarlı; 2) törəmək, doğmaq, meydana çıxmaq, baş vermək. *Nöqsanlar diqqətsizlikdən irəli gəlmişdir.* – [Bəypolad:] *Cəsarətimin əfv ediləcəyinə əminəm, çünki səmimiyyətdən irəli gələn qüsurlar əfv edilir.* H.Cavid. **İrəli sürmək** – müzakirə, məlumat və s. üçün təklif etmək, ortaya atmaq. *İttiham irəli sürmək. Tezis irəli sürmək. Namizədlər irəli sürmək.* **İrəlidə getmək** – 1) qabaqcıl olmaq, birinci yeri tutmaq, başqalarını ötüb keçmək. *Yarışda irəlidə getmək;* 2) yol göstərmək, başçılıq etmək, qabaqda getmək. *Birinci gün olduğu kimi yenə də Cavad irəlidə gedir, döyüşçüləri ruhlandırırdı.* Ə.Vəliyev.

**İRƏLİCƏ** *zərf* Qabaqca, öncə; irəlicədən. *İrəlicə kim dedi?*

**İRƏLİCƏDƏN** *zərf* Qabaqcadan, əvvəlcədən. *Gəlməyəcəyini irəlicədən bildirdi. İclas gününü irəlicədən bildirmək.*

**İRƏLİDƏKİ** *zərf* 1. Qabaqda olan, öndə olan; qabaqdakı, öndəki. *İrəlidəki yol. İrəlidəki ev. İrəlidəki adam. – Keşlə yaxınlığında qatarımız dayanmağa məcbur oldu; irəlidəki qatar qəzaya uğramışdı..* S.Hüseyn.

2. Sonra gələcək, növbəti. *İrəlidəki dayanacaqda sərnişinlərdən çoxu düşdü.* Q.İlkin.

**İRƏLİDƏN** *zərf* 1. Qabaqdan, qabaq tərəfdən, öndən, qarşıdan. *İrəlidən bir atlı çıxdı.*

2. Qabaqcadan, irəlicədən. *İrəlidən xəbər vermək lazımdır.*

**İRƏLİ-GERİ** *zərf* 1. Bir tərəfdən o biri tərəfə, bu başdan o başa və əksinə; dalaqabağa. *Qaldırıcı maşınların yüz metr hündürlüyündə polad vışkaları .. irəli-geri hərəkət edir.* (Qəzetlərdən).

2. Başlanğıc-son, əvvəl-son. *Kitabı irəli-geri vərəqləmək.*

◊ **İrəlisini-gerisini düşünmək** (işin və s.-nin) – bir məsələni, işi və s.-ni hərtərəfli təhlil etmək, ətraflı düşünmək, götür-qoy etmək, nə kimi nəticələr verəcəyini nəzərə almaq. [İbrahim xan:] *Bu adam* [Fətəli xan] *işin irəlisini-gerisini düşünmür? – deyə Vaqifə müraciət etdi.* Çəmənzəminli.

**İRƏLİKİ** *sif.* Qabaqkı, (bundan) əvvəlki, ...əvvəl olmuş; keçmiş. *İrəliki məqalələrimizdən "Tərəqqi"nin hörmətli oxucuları gördülər ki, əsillərindən o dərəcədə uzaqda və kənarda durmayıblar.* F.Köçərli. [Hafizə xanım:] *De görüm bəy irəliki arvadına puldan-zaddan göndərir, yoxsa yox?* Ə.Haqverdiyev. [Hacı Murad:] *..Amma irəlidəki arvaddan beş oğlu var, dörd də ay kimi qızı.* S.S.Axundov.

**İRƏLİLƏMƏ** 1. "İrəliləmək"dən *f.is.*

2. İrəliləyiş, yüksəliş, tərəqqi, inkişaf. *Xalq ədəbiyyatının dilində də böyük bir irəliləmə görünürdü.* M.İbrahimov.

**İRƏLİLƏMƏK** *f.* 1. Qabağa doğru hərəkət etmək, irəli getmək, yerimək. *Maşın evə doğru irəliləyirdi. O, yoldaşına tərəf irəlilədi.* – [Ceyran] *ağır və yorğun addımlarla irəliləyirdi.* S.Hüseyn. [Qəhrəman:] *Bizimkilər irəliləyəndə mən yoldaşlarımla bir az asudə nəfəs alırdıq.* H.Nəzərli. *Tahir evlərdən bir az kənar yol tutub, tanış həyətlərə göz gəzdirir, qohum-əqrəbaya rast gələcəyini düşünə-düşünə irəliləyirdi.* M.Hüseyn.

2. Tərəqqi etmək, inkişaf etmək, müvəffəqiyyət qazanmaq, artmaq. ..*Tənqid realizm .. metodu ilə irəliləməyimizdə günəş kimi zəruridir.* S.Rəhimov.

**İRƏLİLƏTMƏ** "İrəlilətmək"dən *f.is.*

**İRƏLİLƏTMƏK** *f.* 1. Durduğu yerdən bir qədər qabağa itələmək, qabağa çəkmək. *Stulu bir az irəlilətmək.*

2. İnkişaf etdirmək, tərəqqisini sürətləndirmək. *"Molla Nəsrəddin" nəinki Azərbaycan ədəbiyyatını, həm də Azərbaycan jurnalistikasını böyük bir təkanla irəlilətdi.* M.İbrahimov.

**İRƏLİLƏYİŞ** *is.* İrəliləmə, tərəqqi, inkişaf, irəliyə doğru hərəkət, nailiyyət, yüksəliş. *Bu tayda isə müqayisəolunmaz dərəcədə böyük irəliləyiş olmuşdur.* M.İbrahimov. *Altı ay çəkmədi, məktəbdə böyük bir irəliləyiş göründü.* Mir Cəlal.

**İRƏLİLİK** *is.* Hər hansı bir işdə irəlidə olma, irəlidə getmə; qabaqcıllıq, tərəqqi, inkişaf.

**İRƏM** *is.* [*ər.*] Şamda, yaxud Yəməndə olduğu rəvayət edilən əfsanəvi bir bağçanın adı olub klassik ədəbiyyatda və folklorda "behişt, cənnət" mənasında işlənmişdir. *Xoş nəğmələnib bülbüli-şeyda ötər oldu; Açıldı irəmlər.* M.V.Vidadi.

**İRƏMƏ** *is.* Yer səthindən azacıq hündür olan yer; təpə, dikdir. *İrəmələr, ay irəmələr; Qoynunda kəkliklər mələr.* (Mahnı). *..İrəmələrdəki kəklik, taxılların içindəki turac və bildirçin .. nadir quşlardır.* Ə.Vəliyev. *Doluxsunmuş buludlara qan çilənir elə bil; Dalır axşam sükutuna o irəmə, o sahil.* Ə.Cəmil.

**İRƏŞ** *məh.* bax **anac** 1-ci mənada. *İrəş toyuq.*

**İRƏŞMƏ, İRƏŞT** *is.* Atın başına bağlanan nazik ip. *Bir az gedəndən sonra Süleyman atının irəştini düzəltmək bəhanəsi ilə düşüb geridə qaldı və quldur getdi qabağa.* Ə.Haqverdiyev. *Oğlan yəhərin qaşına bağlanmış uzun irəşməni açdı, atı yedəkləyib dəyədən uzaqlaşdı.* M.Hüseyn.

**İRFAN** *is.* [*ər.*] 1. Bilik, məlumat; oxumaq və zehin işlətmək nəticəsində hasil olan yetkinlik, kamillik.

2. Mədəniyyət, maarif. *İndidən tərbiyə qıl baği-dili; Bitsin ol bağçada irfan güli.* M.Hadi. *Qanan kim, qandıran kim, nəşri-irfan eyləyən kimdir.* M.Ə.Sabir. *Bir söylə görüm, məktəbi-irfan nəyə lazım? Təhsili-ədəb, dərsi-dəbistan nəyə lazım?* M.S.Ordubadi.

**İRFİDƏ** *is.* Açılmış kündəni təndirə yapmaq üçün alət.

**İRGƏNCİ** *sif.* İyrənc.

**İRİ** *sif.* 1. Həcmcə, ölçücə, cüssəcə böyük, yekə; cüssəli, həcmli. *İri qazan. İri bədən. İri əl. İri uşaq. İri fındıq.* – [Xanım] *uzun, mütənasib boylu, sağlam bədənli, iri qara gözlü bir qadın idi.* H.Nəzərli. [İzzət qarı və Qumru] *obaya çatarkən çobanlar ayağa qalxıb iki iri daş gətirdilər.* Ə.Məmmədxanlı. // Böyük, geniş, vüsətli. *İri zal. İri həyət.*

2. Sayca çoxlu, külli miqdarda olan. *İri dəstə. İri qoşun birləşməsi.* ☐ **İri addım** – geniş addım. **İri bloklar** *xüs.* – bina tikilişində istifadə edilən çox böyük həcmli beton daşlar. **İri kapital** – 1) böyük müəssisələrin sahibləri və inhisarları; 2) çox külli miqdarda pul. **İri məbləğ** – çoxlu pul. **İri mülkədar** (**sənayeçi, tacir** və i.a.) – böyük ölçüdə xüsusi mülkiyyətə sahib olan mülkədar (sənayeçi, tacir və i.a.). **İri pul** – üstündə böyük dəyər yazılmış pul.

**İRİBAŞ(LI)** *sif.* Başı iri olan. *İribaşlı adam. İribaş soğan* (*turp*).

**İRİBAŞLILIQ** *is.* Başı iri adamın, ya heyvanın halı.

**İRİBƏDƏNLİ** *sif.* Bədəni iri olan, bədəncə yekə. *İribədənli adam.*

**İRİBURUN(LU)** *sif.* Burnu iri olan.

**İRİBUYNUZLU** *sif.* Buynuzları iri olan. *İribuynuzlu camış.*

**İRİCƏ** *sif.* Çox iri, yaxud nisbətən iri. *İricə ağac. İricə daş.*

**İRİÇİÇƏK(Lİ)** *sif.* Çiçəkləri iri olan. *İriçiçək üskükotu.*

**İRİDANƏLİ** *sif.* Danələri iri olan. *İridanəli mirvari.* – *Qətibə .. iridanəli inci çıxarıb, Səba xanımın boynuna salaraq: – Bunu Bağdadda sənin adına almışam, – dedi.* M.S.Ordubadi.

**İRİDƏNLİ** *sif.* Dənləri iri olan. *İridənli darı. İridənli buğda.*

**İRİDIRNAQLI** *sif.* Dırnaqları iri olan.

**İRİDİŞ(Lİ)** *sif.* Dişləri iri olan. *İridişli çarx. İridiş daraq.*

**İRİDODAQLAR** *is. zool.* Xanıbalığıkimilər dəstəsindən əlvan rəngli dəniz balıqları fəsiləsi.

**İRİGÖVDƏLİ** *sif.* Gövdəsi iri olan. *İrigövdəli ağac.* – *Meşənin ətəyindən, təkəmseyrək kolların arasından qara paltarlı, irigövdəli bir arvad çıxdı.* İ.Hüseynov.

**İRİGÖZ(LÜ)** *sif.* Gözləri iri olan. *İrigöz qız. İrigöz oğlan.* – *Bunların* [əcnəbilərin] *arasında ucaboylu, irigözlü, buğdayısifət bir gənc vardı.* Çəmənzəminli. *İrigöz, yastıburun Validənin görüşü hamıya mane olur.* H.Seyidbəyli.

**İRİGÖZLÜLÜK** *is.* İrigözlü adamın halı.

**İRİ-XIRDA** *sif.* Hər cür, hər boyda, hər ölçüdə, hər həcmdə. *Ağacda iri-xırda nə meyvə vardısa, töküldü.*

**İRİKALİBRLİ** *sif. xüs.* Kalibri adi kalibrdən böyük olan; çapı, ölçüsü böyük olan. *İrikalibrli pulemyot.*

**İRİKÖK(LÜ)** *sif.* Kökü iri olan. *İrikök çuğundur.*

**İRİLƏMƏ** "İriləmək"dən *f.is.*

**İRİLƏMƏK** *f.* Həcmcə, ölçücə böyütmək, iri eləmək. *Kündələri iriləmək.*

**İRİLƏNMƏ** "İrilənmək"dən *f.is.*

**İRİLƏNMƏK** *f.* 1. Həcmcə, ölçücə, cüssəcə böyümək, yekələşmək. *Meyvələr irilənib. Ağaclar irilənib.*

2. Böyümək, boya-başa çatmaq. *Uşaq daha irilənib.* – [Ağanın] *başı üçün, o iriləndə qoymaz ki, bu dünyada bir canlı-cinli də yel olub Soltan ağanın yanından belə ötsün.* S.Rəhimov.

3. *məc.* Geniş açılmaq (göz haqqında). *Məşədinin alışan balaca gözləri irilənib pərpər çaldı.* S.Rəhimov. *Sultanın iri gözləri elə bil bir az da iriləndi.* İ.Hüseynov.

**İRİLƏŞDİRİLMƏ** "İriləşdirilmək"dən *f.is.*

**İRİLƏŞDİRİLMƏK** *məch.* İri hala salınmaq, həcmcə, ölçücə böyükləşdirilmək.

**İRİLƏŞDİRMƏ** "İriləşdirmək"dən *f.is.*

**İRİLƏŞDİRMƏK** *f.* Həcmcə, ölçücə iri hala salmaq, irilətmək, böyütmək.

**İRİLƏŞMƏ** "İriləşmək"dən *f.is.*

**İRİLƏŞMƏK** *f.* Daha iri olmaq; həcmcə, ölçücə, cüssəcə daha da böyümək; yekələnmək, irilənmək. *Meyvələr gündən-günə yetişib iriləşir.* – [Fərmanın] *ortaboylu nazik vücudu getdikcə iriləşir, bədənindəki uşaq kövrəkliyi daha az hiss olunurdu.* Ə.Sadıq. *Göy yerə töküləcəkmiş kimi müdhiş bir gurultu qopdu. Əvvəl xırda, get-gedə iriləşən quşbaşı dolu yağdı.* M.Rzaquluzadə.

**İRİLƏTMƏ** "İrilətmək"dən *f.is.*

**İRİLƏTMƏK** b a x **iriləşdirmək**.

**İRİLİ-XIRDALI** *sif.* 1. Böyüklü-kiçikli, hər yaşda, böyük və kiçik. *Körpünün üstü cırcındıra bürünmüş irili-xırdalı uşaqlarla dolu idi.* M.Rzaquluzadə.

2. Həm iri, həm xırda; həm böyük, həm kiçik. *Səhər tezdən yola çıxdıq. Nügədinin kölgəlik yollarını aşıb irili-xırdalı kəndlərdən keçdik.* R.Rza. *..Bir səhər Qumru yuxudan ayılarkən, artıq dəzgahını bir yığın irili-xırdalı yumaqlarla bəzənmiş gördü.* Ə.Məmmədxanlı.

**İRİLİK** *is.* İri şeyin hal və keyfiyyəti; böyüklük, yekəlik. *Dənin iriliyi. Başın iriliyi. Bu irilikdə qoz görməmişəm.* – [Hacı Murad:] *Bu irilikdə mirvari .. heç Xəta padşahının xəzinəsində də tapılmaz.* S.S.Axundov.

**İRİN** *is.* [*ər.*] *tib.* Bədənin hər hansı bir yerində toxumaların iltihabı nəticəsində əmələ gələn yaşıl və sarıya çalan pis qoxulu qəliz maddə; yara çirki. *Yaradan irin axmaq. Çiban irini.*

**İRİNLƏDİCİ** *sif.* İrin əmələ gəlməsinə səbəb olan, irin törədici. *İrinlədici maddə. İrinlədici bakteriya.*

**İRİNLƏMƏ** "İrinləmək"dən *f.is.*

**İRİNLƏMƏK** *f.* İrin əmələ gəlmək. *Yara irinləyib.*

**İRİNLƏTMƏ** "İrinlətmək"dən *f.is.*

**İRİNLƏTMƏK** *f.* İrinləməsinə səbəb olmaq, irin törətmək.

**İRİNLİ** *sif.* İrini olan, irin yığılmış, irin axan. *İrinli yara. İrinli çiban.*

**İRİNLİLİK** *is.* İrinli yaranın halı.

**İRİNVERƏN** *sif.* İrinli. *İrinverən yara.*

**İRİS** [*yun.*] Şokolad rəngli kubiklər şəklində konfet növü.

**İRİSİFƏT(Lİ)** *sif.* Sifəti, üzü iri olan. *İrisifət oğlan.*

**İRİŞDİRİLMƏ** "İrişdirilmək"dən *f.is.*

**İRİŞDİRİLMƏK** *məch.* Bir-birinə çatdırılmaq, bir-biri ilə qovuşdurulmaq, yetişdirilmək.

**İRİŞDİRMƏ** "İrişdirmək"dən *f.is.*

**İRİŞDİRMƏK** *f.* Yetişdirmək, çatdırmaq, qovuşdurmaq.

**İRİŞİLMƏZ** *sif.* Yetmək, çatmaq, mümkün olmayan; əlçatmaz. *Mən ağ bir göyərçin olsaydım; Əngin, irişilməz üfüqlərdə yaşardım.* H.Cavid. [Güllər] *pianinosu arxasında .. irişilməz xəyallara dalaraq saatlarla çalırdı.* İ.Əfəndiyev. *Planetlər, uçulub dağılan o dəhşətli uzaqlıqlar daima mənə qədim bir əfsanə kimi gözəl və irişilməz görünürdü.* Ə.Məmmədxanlı.

**İRİŞMƏ¹** "İrişmək"¹dən *f.is.*

**İRİŞMƏ²** "İrişmək"²dən *f.is.*

**İRİŞMƏK¹** *f.* Çatmaq, yetişmək. *Bahar oldu, açıldı yüzündən pərdə gülzarın; İrişdi qönçənin dövrü, zamanı qalmadı xarın.* Nəsimi. *Doğulduğu gecədən irişincə bu günə; Yollarda yonca kimi böyüdü öz-özünə.* Ə.Cavad.

**İRİŞMƏK²** *f. dan.* Boş-boş gülmək, hırıldamaq; dişlərini ağartmaq. *Ramazanov mənə yaxınlaşdı, məni tanıyıb, yalandan irişdi.* S.Rəhman. *Fərman Əhmədin üzünə mənalı-mənalı baxıb irişdi: – Ay lopabığ, yəqin oğurluq ətidir.* Ə.Abasov. *Mən də malları gündə dörd dəfə suya gətirəcəyəm, – deyə Yusif irişdi.* B.Bayramov.

**irişə-irişə** *zərf* Dişlərini ağardıb gülə-gülə, boş-boş gülə-gülə. [Vəli irişə-irişə:] *Mən bilirəm, sən nə istəyirsən..* Ü.Hacıbəyov. *Molla Qurban salam verəndə Fərrux diksinib başını qaldırdı və irişə-irişə dedi..* Ə.Vəliyev. *Cılız, gödəkboy Əliqulu xoşa getmək üçün irişə-irişə dedi..* M.Süleymanov.

**İRİYANAQ(LI)** *sif.* Yanaqları iri olan. *İriyanaqlı uşaq.*

**İRİYARPAQ(LI)** *sif.* Yarpaqları iri olan. *İriyarpaqlı ağac.*

**İRKİLMƏK** *f. məh.* Ürkmək. *Dəmirqaya əvvəl baxışda irkildi.* H.Nəzərli.

**İRQ** *is.* [*ər.*] Mənşə və bəzi irsi xüsusiyyətlərinə (saçlarının, dərilərinin rənginə, başlarının quruluşuna və s.) görə bir olan tarixən təşəkkül tapmış insanlar qrupu. *Burada ağ irqdən qızlar var idi, yaşları çox az idi, ən çox yaşlı olanları 10 yaşdan artıq olmazdı.* M.S.Ordubadi. // Heyvan və bitki təsnifatını bildirmək üçün bir termin kimi də işlənir.

**İRQA** *is. bot.* Qızılgül fəsiləsindən dağlıq və qayalıq yerlərdə bitən kol bitki. *İrqa 2 metrə qədər hündürlükdə, qışda yarpağı tökülən koldur. May ayında çiçəkləyir. Əvvəl qırmızı, sonra qara rəngli olan meyvəsi avqust ayında yetişir.* H.Qədirov.

**İRQÇİ** *is.* İrqçilik tərəfdarı.

**İRQÇİLİK** *is.* "Yüksək" və "aşağı", "kamil" və "qeyri-kamil" insan irqləri olması fikrinə əsaslanan ifrat mürtəce, elmə zidd nəzəriyyə və siyasət; irqlər (xalqlar) arasında nifaq və ədavət salma. *İrqçilik siyasəti.*

**İRQİ** *sif.* İrqə aid olan. *İrqi əlamətlər. İrqi ayrı-seçkilik* (müstəmləkəçilərin ağ irqə mənsub olmayan xalqların hüququnu tapdalaması).

**İRLANDİYALI** *is.* İrlandiya əhalisindən olan, İrlandiya vətəndaşı.

**İRMAQ** *is.* Çay. *Onda ki ağ omuzlara töküldü saçlar; Əsdi yarpaq, coşdu irmaq, güllər oynadı.* C.Cabbarlı. *Qatıldım bu yerdə əyləncələrə; Anlamış hər irmaq, bilmiş hər dərə.* M.Müşfiq. *Siz hey könlüm kimi coşan irmaqlar; Günahsız göz yaşım sel kimi axar.* S.Rüstəm.

**İRMƏK**[1] *f.* Çatmaq, yetişmək, irişmək. *Mən Cüməyəm, bir murada irmədim; Ha ki cəfa çəkdim, səfa sürmədim.* Molla Cümə. *Kənd həyatının qoyduğu və mənim indi də ağlım irmədiyi bu adətə istər-istəməz tabe olmağa məcbur idik..* Qantəmir. *Füzuli kamına qəlbən irmədi; Sevdiyi telləri öpüb hörmədi.* M.Rahim.

**İRMƏK**[2] *is.* Adətən mal-qaraya verilən iri və yaxşı əzilməyən buğda, arpa unu. // Narın kəpək.

**İRPƏ** b a x **ürpə**. ☐ **İrpə getmək** – ürpərmək. *..Bir qoca qarı öz gəlini ilə bulaqda mənə rast gəldi, gəlin mən tərəfə baxmadı, baxmağı o yana dursun, hələ bədəni irpə getdi.* A.Divanbəyoğlu.

**İRRASİONÁL** *sif.* [*lat.*] 1. *fəls.* Fəlsəfədə: ağılla dərk edilə bilməyən, məntiqə uymayan, məntiqcə izah edilə bilməyən.

2. *riyaz.* Nə tam, nə də kəsr ədədlərlə ifadə oluna bilməyən, vahidlə ölçülə bilməyən. *Sıfır, müsbət və mənfi kəsr və tam olmayan ədədlərə riyaziyyatda irrasional ədədlər deyilir.* Z.Xəlilov.

**İRRASİONALÍZM** [*lat.*] Fəlsəfədə: obyektiv varlığı irrasional hesab edən və elmi, məntiqi idrakı inkar edən cərəyan.

**İRRASİONALLIQ** *is.* Ağılla dərk edilə bilməmə, məntiqə uymama, məntiqcə izah edilə bilməmə.

**İRRİQÁSİYA** [*lat.*] *k.t.* Rütubəti az olan torpaqların məhsuldarlığını artırmaq üçün onların süni surətdə suvarılması. *İrriqasiya qurğuları.*

**İRS** *is.* [*ər.*] 1. Sahibinin ölümündən sonra başqasının (övladın və ya yaxın qohumların) ixtiyarına keçən mal, mülk və s. miras. *İrs almaq. İrs çatmaq.* – [Gülsabah:] *Xanım, qardaşın arvadının məgər irsdə payı var?* M.F.Axundzadə. *..Məlum oldu ki, bir qədər pul, bir ev atasından və on iki manatlıq cavahirat və ev şeyi də anasından Nurəddinə irs qalıb.* S.S.Axundov. // Valideyndən övlada keçən cismani və ya ruhi keyfiyyət, hal. [Hacı Nuru şair:] *Kamal ata kürkü deyil ki, irs ilə övlada yetişə.* M.F.Axundzadə.

2. Əvvəlki dövrlərdən, əsrlərdən, böyük şəxsiyyətlərdən qalmış mədəniyyət əsəri. *Nizaminin ədəbi irsi. Cabbarlı irsi. – Fəxrəddin .. xələtin yalnız nəfis və incə olması ilə deyil, onun tarixi bir irs olduğu ilə maraqlandı.* M.S.Ordubadi. *Azərbaycan .. ədəbiy-*

*yatşünaslığı Molla Nəsrəddinin ədəbi irsinə daha dərindən yanaşmalıdır.* M.İbrahimov.

**İRSAL** *is.* [*ər.*] *klas.* Göndərmə, yollama. ◻ **İrsal etmək (qılmaq)** – göndərmək, yollamaq. *Ənam edibən ona bəsi mal; Leyli tələbinə qıldı irsal.* Füzuli. *Alıb irsal qıllam nəqdi-can ilə nə əmr etsən; Buyur, hər xidmətin vardır bizə nisbət, xudahafiz!* Q.Zakir. *Bu yerdən ötəri bir para əhval xidmətinə yazıb etmişəm irsal.* M.F.Axundzadə.

**İRSAL-MƏRSUL** [*ər.*] *köhn.* Yazışma, məktublaşma, bir-birinə məktub göndərmə. ◻ **İrsal-mərsul etmək, irsal-mərsula girmək** – yazışmaq, məktublaşmaq, məktub göndərmək. [Ağa Məhəmməd xan:] *Gürcüstan valisi İrakli bir yandan Rusiya dövləti ilə irsal-mərsulə girib, istəyir müstəqil padşah olsun.* Ə.Haqverdiyev.

**İRSƏN** *zərf* [*ər.*] İrsi olaraq, irs yolu ilə, ata-anadan keçərək. *Lamarka görə, həyat şəraitinin təsiri ilə baş verən dəyişmələr irsən nəslə keçir.* M.Axundov.

**İRSİ** *sif.* [*ər.*] 1. Miras olaraq qalan, miras yolu ilə keçən. *İrsi torpaq. İrsi mülk.*

2. İrs olaraq ata-anadan keçən, nəslən keçən. *İrsi xasiyyət. İrsi xəstəliklər. – Tərbiyə işi nəsli və irsi bir iş deyildir.* M.S.Ordubadi. [Müəllim:] *Bəlkə, dedim, qadının bu xasiyyəti irsidir, nəsildən gəlmədir.* Mir Cəlal.

**İRSİLİK** *is.* İrs olma, irsdən gəlmə, irsi hal.

**İRSİYYƏT** *is.* [*ər.*] 1. Orqanizmin öz əcdadından almış olduğu təbii xüsusiyyətlərin məcmusu.

2. Canlı orqanizmin öz fiziki və psixi xüsusiyyətlərini nəslinə keçirmə hadisəsi. *İrsiyyət haqqında nəzəriyyə. – Cürbəcür bioloqlar cinsiyyət və irsiyyət haqqında cild-cild elmi əsərlər yazmışlar.* M.Rzaquluzadə.

**İRŞAD** *is.* [*ər.*] *klas.* Doğru yol göstərmə, doğru yola çəkmə, qəflətdən oyatma. *İrşadını bilmədim qənimət; Yüz vay ki, fövt olundu fürsət.* Füzuli. *Döydülər, söydülər, əl çəkmədim irşadımdan.* A.Səhhət. ◻ **İrşad qılmaq** *klas.* – doğru yola gəlmək, qəflətən oyanmaq. *Firqətin dövründə çəkdim möhnətü cövrü cəfa; İmdi vəslin yoluna irşad qılmaq vaxtıdır.* Xətayi. **İrşad etmək** *klas.* – doğru yola çəkmək, qəflətdən oyatmaq. *Sən onların dinini bir tərəfə qoy və onların batil olması haqqında heç bir söz söyləmə və bəlaliklə, onları irşad etməyə başla.* M.F.Axundzadə. *..Kənarda durmaqla millətin ehtiyacını və dərdü halını bilmək olmaz və .. ona kömək vermək, dərdinə əlac tapmaq və onu haqqa irşad etmək qeyri-mümkündür.* F.Köçərli.

**İRTİBAT** *is.* [*ər.*] Rabitə, əlaqə, bağlılıq. *..Bizim səadətimizlə yoldaşımızın səadəti arasında böyük bir irtibat vardır.* Ü.Hacıbəyov. *..Məruf bir zat Azərbaycana gəldi, qeyri-rəsmi bir irtibat yaratdı.* M.İbrahimov.

**İRTİBATÇI** *is. hərb.* Rabitəçi, rabitə əsgəri. *..Arada bir irtibatçısından öyrəndi ki, .. top da hələ yaxşı müqavimət göstərməkdədir.* Ə.Əbülhəsən.

**İRTİBATSIZ** *sif.* Rabitəsiz, rabitəsi, əlaqəsi olmayan, bir-birinə uyğun gəlməyən, bir-biri ilə bağlı olmayan. [Gülzarın] *sözləri irtibatsız və nizamsız olduğu üçün, bəlkə məntiqsiz yerləri də var idi.* C.Cabbarlı.

**İRTİCA** *is.* [*ər.*] Dövrü keçmiş hakim siniflərin ictimai tərəqqiyə qarşı siyasi, iqtisadi və ideoloji müqaviməti; cəmiyyətin inkişafına mane olan keçmiş köhnə üsul və qaydaları mühafizə və ya bərpa etmək cəhdləri. *Təbriz şəhəri irticanın və siyasi intriqaların mərkəzinə çevrildi.* M.S.Ordubadi. *Qara və amansız irtica qanlı intiqam şənlikləri yapdı.* H.Nəzərli. *Çarizm və .. irtica meydan sulasa da, müvəqqəti məğlubiyyət inqilabçıları ruhdan salmadı.* M.İbrahimov.

**İRTİCAÇI** *is.* Siyasi irtica tərəfdarı, mədəniyyət və tərəqqi düşməni.

**İRTİCAÇILIQ** *is.* İrtica tərəfdarlığı, irtica siyasəti yeritmə, ictimai tərəqqiyə və mədəniyyətə düşmənlik.

**İRTİCAL** *is.* [*ər.*] Qabaqcadan düşünmədən sinədən şeir və ya söz söyləmə; bədahət.

**İRTİCALƏN** *zərf* [*ər.*] Qabaqcadan düşünmədən, sinədən; bədahətən. [Çopo:] *İrticalən söylədiyi şeirdən* [Milnirin] *şair olduğu meydana çıxdı.* Çəmənzəminli.

**İRTİCAPƏRƏST** [*ər.* irtica və *fars.* ...pərəst] b a x **irticaçı**.

**İRTİCAPƏRƏSTLİK** b a x **irticaçılıq**.

**İRTİHAL** *is.* [*ər.*] *köhn.* 1. Yüksəlmə, yuxarı qalxma.

2. Tərəqqi etmə, inkişaf etmə.

3. Yüksəklik.

**İRTİKAB** *is.* [*ər.*] *köhn.* Günah iş görmə, günaha batma, pis və ya qadağan edilmiş bir iş görmə. ☐ **İrtikab etmək** – günah iş görmək, qadağan edilmiş pis bir iş görmək. *Niyə verdin fənayə doğruluğu; İrtikab eylədin bu oğruluğu?* M.Ə.Sabir.

**İRTMƏK** *is.* Heyvanların quyruqlarının dibindəki sümük və bunun buğumu. // Quyruq. *At irtməyini əyri tutur. – Keşnişlə, yemliklə bəzənib təpə; Ağ irtmək ceyranı edərdi qonaq.* H.K.Sanılı. *Dizlərini yerə qoyub irtməklərini oynada-oynada, analarının döşünü dümsükləyə-dümsükləyə əmişən quzular göy otun üstünə səpələnmişdilər.* R.Rza.

**İRTMƏKLƏMƏ** "İrtməkləmək"dən *f.is.*

**İRTMƏKLƏMƏK** *f.* Heyvanın irtməyindən yapışmaq. *Dananı irtməkləmək. Atı irtməkləmək.*

**İRZ** *is.* [*ər.*] Namus, isмət, iffət, şərəf (çox vaxt namus sözü ilə birgə işlənir). *Xain olsaq əgər bu dünyadə; İrzü namusumuz gedər badə.* M.Ə.Sabir. [Piri baba:] *Hansı bir rəiyyət qızının irz və namusuna ağalar toxunmamışdır.* S.S.Axundov.

**İRZSİZ** *sif.* İrzi, namusu olmayan; abırsız. *İrzsiz adam.*

**İSABƏT** *is.* [*ər.*] 1. Hədəfə çatma, hədəfə dəymə, hədəfə yetişmə. ☐ **İsabət etmək** – dəymək, çatmaq. *Tapança bir daha partlar,* [güllə] *Əşrəflə Musanın arasında duran Rozanın köksünə isabət edər.* H.Cavid.

**İSA(Q)-MUSA(Q)** *is.* Yaz, yay gecələrində həzin səslə oxuyan bir quş. *Uzaqlarda isa-musa quşunun səsi eşidilirdi.* Ə.Vəliyev. *Yalnız isaq-musaq yorulmadan səslənir.* Ə.Əbülhəsən. *Haradasa isaq-musaq quşları bir-birini səsləyir, yerinə girən kimi dərin yuxuya getmiş Aşıq Cəlal rahat-rahat nəfəs alırdı.* Ə.Məmmədxanlı.

**İSBAT** *is.* [*ər.*] Sübut; əsaslandırma, sübut etmə. *Ey Füzuli, mən qənaət mülkünün sultanıyam; Səltənət isbatı əynimdə pəlasi-fəqr bəs.* Füzuli. *Tez verəsən bu sözlərin isbatın: Nədəndi binası abi-həyatın?* Aşıq Ələsgər. ☐ **İsbat etmək (eləmək)** – sübut etmək. *Yalanı kürsüyə mindirir qəni; Ac eyləyə bilməz doğrunu isbat.* Q.Zakir. *İndi cəmi qəzetlər başlayıblar sultanın vətəninə göstərdiyi düşmənçiliyi isbat eləməyə.* C.Məmmədquluzadə. *Çox ömr eləyib, çox da hünər etmişəm isbat; Bu dari-cahanda.* M.Ə.Sabir. **İsbat olmaq** – sübut olmaq, sübuta yetmək. **İsbat olunmaq** – sübut olunmaq. **İsbata yetirmək** – sübut etmək, qəbul etdirməyə çalışmaq. ..[Xanpəri] *dəlil-sübut gətirir, dediklərini isbata yetirir, sözlərini doğruluğa çıxarırdı.* Ə.Vəliyev. **İsbata keçməmək** – sübuta yetməmək, sübut edilə bilməmək, qəbul olunmamaq. *Ərzə verdik keçən qubernatə; Keçmədi, heyf, ərzə isbatə.* S.Ə.Şirvani. **İsbati-vücud** *köhn.* – varlıq, varlığını göstərmə, mövcud olduğunu göstərmək üçün bir yerdə görünmə. [Fərhad:] *Bəli, doğrudan da sizin isbati-vücudunuzla daha da gözəlləşən təbiət mütləq məni ah çəkməyə məcbur etdi.* C.Cabbarlı. **İsbati-vücud etmək** *köhn.* – şəxsən olmaq, iştirak etmək. *Hər bir ziyafətdə Mirzə Səfər isbati-vücud edərdi.* Ə.Haqverdiyev. *Qarabağ pambıq bəylərinin, demək olar ki, hamısı bu məclisdə isbati-vücud edirdi.* Ə.Vəliyev.

**İSBATLI** *sif. dan.* 1. Sübutlu, sübut olunmuş, dəlilli.

2. Layiqli, görkəmli, yararlı. *İsbatlı adam. İsbatlı paltar.* ☐ **İsbatlı olmaq** – layiqli olmaq, yaramaq. *Çoxları da yüngül, isbatlı olsun deyə, İlyasa tikməli ipək yaylıqlar hazırlamışdılar..* Mir Cəlal.

**İSBATSIZ** *sif. dan.* Layiqsiz, görkəmsiz, yararsız. *İsbatsız pay. İsbatsız geyim.*

**İSBİRƏ** *is.* Xırda sızaqlar şəklində səpgi. *Ağız isbirəsi. Boğaz isbirəsi.*

**İSBİRƏLİ** *sif.* İsbirəsi olan.

**İSƏ** *bağl.* 1. Qarşılıq bildirən bağlayıcılardan olub, əksərən tabesiz mürəkkəb cümlə tərkibindəki cümlələri və bəzən həmcins üzvləri bağlayır. *Onlardan biri həkim, o birisi isə mühəndisdir. Onun işi çox, vaxtı isə azdır. – Xoruzlar banlaşır,* [Turab] *isə yata bilmirdi.* M.Hüseyn. ..*Sədr ilə Eyvaz stolun bir tərəfində, Gülşən isə o biri tərəfində oturmuşdu.* Ə.Vəliyev.

2. "Əgər", "hərgah" mənasında ədat yerində işlənir. [Cəllad:] *Pək suçlu isəm, görməli məzur; Aclıq məni etmiş buna məcbur.* H.Cavid. // Qeyri-müəyyənlik bildirir. *Bu sözləri harada isə oxumuşam. Onu harada isə görmüşəm. – Ara-sıra haradan isə vahi-*

*məli bayquş səsi gəlirdi.* M.İbrahimov. *Yoldaşım göy otun üzərində uzanıb əlindəki tüfənglə haranı isə nişan almaq istəyirdi.* S.Şamilov. // Halbuki. *Biz onu burada gözləyirik, o isə çıxıb gedib. – Yusif isə ancaq bu görüşməyin barəsində fikir edirdi.* N.Nərimanov.

**İSƏVİ** *is.* və *sif.* [*ər.*] *köhn.* İsa dininə mənsub adam; xristian, xaçpərəst. [Papas Şeyx Sənana:] *Heç bu mümkünmü isəvi bir qız; Bir müsəlmanə varsın. Anladınız!..* H.Cavid.

**İSƏVİLİK** *is. köhn.* İsa dininə mənsub olma; xristianlıq, xaçpərəstlik.

**İSFAHAN** *is.* [*xüs. is.*-dən.] *mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *12 əsas muğam bunlar idi: üşşaq, nəva, busəlik, rast, əraq, isfahan, zirəfkənd, büzürg, zəngulə, rəhavi, hüseyni və hicaz.* Ü.Hacıbəyov.

**İSFƏNDAN** *is.* Ağcaqayın.

**İSHAL** *is.* [*ər.*] *tib.* Mədə pozğunluğu, qarnı işləmə, ayaqyoluna düşmə. *İnsanlar bəzi bitkilərin ishal törətdiyini, bəzilərinin isə qusduruculuğunu görür və sonradan bundan istifadə edirdilər.* M.Əfəndiyev.

**İSHALOTU** bax **əzvay** 1-ci mənada. *Parklarda, bağçalarda, bağlarda, mənzillərimizin pəncərələrində aloe bitkisinə tez-tez rast gəlirik. Bu bitkiyə xalq arasında "əzvay", "ishalotu", bəzən isə "yüzildənbir" deyirlər.* (Qəzetlərdən).

**İSIRQA** *is. tib.* Boğazda, qulaq ardında səpgili dəri xəstəliyi.

**İSİM** *is.* [*ər.*] 1. *köhn.* Ad. *Hökmün Malik Əjdər, ismindir Ədhəm: Didələrim qan-yaş tökər dəmadəm.* Aşıq Abas. [Rəcəbli:] *İsminiz nədir?* [Mirzə Heydər:] *İsmim Heydərdir.* Ə.Haqverdiyev. [Zabit:] *Orada isimləri yazılı məhbusları bənə təslim etməlisən.* H.Nəzərli.

2. Qrammatikadan: canlı və cansız əşyaların adlarını bildirən nitq hissəsi. ◻ **İsmi-cəm** *köhn.* – toplu mənalı isim. **İsmi-xas** *köhn.* – xüsusi isim.

◊ **İsmi-əzəm** – nağıllarda: sehirli dua adı, tilsim duası. *Qız Məlikməmmədə dedi: – O səni bu günə salan adamdı. Düz qırx gündü ki, mən onnan çırpışıram. Axırda mən ismi-əzəm oxuyub onu yatırtmışam.* (Nağıl). **İsmi-şəb** – hərbi xidmətdə, yaxud gizli şəraitdə öz adamlarını tanımaq üçün tətbiq edilən və ancaq əlaqədar şəxslərin bildiyi gizli şərti söz, ya ifadə; parol. *Şeypur çalınandan sonra küçələrə ancaq ismi-şəb bilən adamlar çıxa bilərdi.* P.Makulu. **İsmi-şərif** *köhn.* – əsil mənası "şərəfli ad" olub, keçmişdə birinin adını soruşduqda hörmət üçün işlənərdi, indi çox vaxt zarafat və ya kinayə ilə deyilir. *İsmi-şərifiniz nədir? – ..İki il keçmiş kənddə şura seçkisi başlananda, şura sədrliyinə qoyulan namizədlərin siyahısında Tükəzban xalanın da ismi-şərifi yad olunmuşdu.* B.Talıblı.

**İSİMLƏŞMƏ** "İsimləşmək"dən *f.is.*

**İSİMLƏŞMƏK** *f.* İsim kimi işlənmək, isim yerini tutmaq, əşyalaşmaq.

**İSİNDİRMƏ** "İsindirmək"dən *f.is.*

**İSİNDİRMƏK** *f.* 1. Qızdırmaq. *Suyu isindirmək. Evi isindirmək.* // Məc. mənada. *Mən səni ürəyimdə; İsindirən bir qızam.* M.Rahim.

2. *məc.* Özünə öyrətmək, özünə alışdırmaq, isinişdirmək, bağlamaq. *Dursun birinci gündən yalnız Güllüsünü özünə isindirmək, onu özünə ram etməkdən başqa bir şey düşünməyirdi.* A.Şaiq.

**İSİNİKLİ** *sif.* Tez isinişən, tez alışan, tez öyrəşən, istiqanlı. *İsinikli uşaq.* – [Bənövşə:] *İsinikli adamsan, səndən incimək olmaz.* M.İbrahimov.

**İSİNİŞDİRİLMƏ** "İsinişdirilmək"dən *f.is.*

**İSİNİŞDİRİLMƏK** *məch.* Özünə alışdırılmaq, özünə öyrədilmək.

**İSİNİŞDİRMƏ** "İsinişdirmək"dən *f.is.*

**İSİNİŞDİRMƏK** bax **isindirmək** 2-ci mənada. *Qız uşağını da öyrətmək, isinişdirmək olar.* Mir Cəlal.

**İSİNİŞMƏ** "İsinişmək"dən *f.is.*

**İSİNİŞMƏK** 1. *qarş.* Bir-birinə alışmaq, bir-birinə öyrəşmək, bir-birinə bağlanmaq.

2. *f.* Öyrəşmək, alışmaq, bağlanmaq. *..Zira ki* [Əzim] *hər kəsdən qaçır, kimsəyə isinişmək istəmirdi.* A.Şaiq. [Dərviş:] *Dayı, bir az da qal, şəhər məişətinə isinişərsən.* A.Divanbəyoğlu. *Bəli, anamız kimi isinişmişik biz ona.* B.Vahabzadə.

3. *f.* Hamı bir yerdə qızınmaq.

**İSİNMƏ** "İsinmək"dən *f.is.*

**İSİNMƏK** *f.* 1. Qızmaq, hərarəti artmaq. *Gün çıxdı, hava isindi. – Axır o ola bilər ki, dəmir isinər, isinər, axırda yavaş-yavaş başlar qızarmağa.* C.Məmmədquluzadə. *Birdən* [Cavadın] *keçə çəkməli ayağı isindi. O, ayağına baxdı. Yaralanmışdı.* Ə.Vəliyev. *Qış çıxır və havalar yavaş-yavaş isinməyə başlayırdı.* S.Şamilov.

2. Qızınmaq, istilənmək. *Sobanın qabağında isinmək. – Keçək, bir az içəridə isinək.* H.Seyidbəyli. *O, əvvəl çay qoydu, isinsin deyə; Sonra da baxaraq bir az güzgüyə; Seyrək saçlarını daradı yana.* Z.Xəlil.

3. *məc.* Nəvaziş görmək, oxşanmaq. ..[Firiduna] *elə gəlirdi ki, qadın nəvaziş və məhəbbəti ilə isinməyən bir qəlb səadətdən məhrumdur.* M.İbrahimov. *Ana qucağında isinərkən, mehriban əllərlə oxşanarkən .. heç bir şey sənin üçün qorxulu deyil.* Mir Cəlal. *Qüvvətimiz, ümidimiz, arzularımız bu məhəbbətlə isinmişdir – bu məhəbbət analarımızın ilk öpüşündən ürəyimizə axmışdır.* Ə.Məmmədxanlı.

4. *məc.* İsinişmək. *Əvvəlləri* [Arazgil] *doktor Şamilə bir o qədər isinə bilmirdi.* A.Şaiq. *Polkovnik bizə tez isinmişdi.* M.Hüseyn. *Axşamdan bəri* [müəllimlə] *xeyli söhbət etmiş və iki köhnə dost kimi bir-birimizə isinmişdik.* M.Rzaquluzadə.

**İSİTMƏ** 1. "İsitmək"dən *f.is.*

2. Qızdırma, titrətmə-qızdırma, malyariya. *Ağcaqanadın müxtəlif növləri isitmə törədicilərini insana keçirir.*

**İSİTMƏK** *f.* 1. İsti eləmək, isti hala gətirmək, qızdırmaq. *Suyu isitmək. Xörəyi isitmək. – Toxta, balacığım, qoy donmuş canını bir isidim.* S.S.Axundov. *Tahir motoru isidib işə salanda* [qızı] *bir də səsləməyə məcbur oldu..* M.Hüseyn. // İstilik vermək, öz hərarətini vermək, qızdırmaq. [Günəş] *şüaları insana xoş gəlir, canını isidirdi.* M.İbrahimov. *İlıq may günəşi .. tarlaları isitmişdi.* Ə.Vəliyev. // Məc. mənada. [Qızın] *atəşli gözləri məni yenidən isitdi.* Çəmənzəminli. *Acizdir önündə qoca təbiət; İsidir qəlbini mehrü məhəbbət.* M.Rahim. *İsitsin dostları ılıq nəfəsim; Könül rübabını min teldən çalır.* N.Rəfibəyli.

2. Bədənin hərarəti artmaq (xəstəlik nəticəsində). *Xəstə isidib. Bərk isitmişəm.* // *dan.* İsitmə xəstəliyi keçirmək, titrədib-qızdırmaq. *Uşaq isidir.*

3. *məc.* Möhkəmlətmək mənasında. *Möhlətov öz yerini isidəndən sonra, şəxsi planlarını həyata keçirmək vaxtının çatdığını yəqin etdi.* Mir Cəlal.

**İSİTMƏLİ** *sif.* 1. İsitmə xəstəliyi olan, isitmə çəkən, titrədib-qızdıran. *İsitməli adam.* // İs. mənasında. *İsitməlilərə kinə iynəsi vurmaq. İsitməlilərə məxsus palata.*

2. İsitmə xəstəliyi yayılmış. *İsitməli yerlər.*

**isitməli-isitməli** *zərf* Qızdırmalı halda, qızdırma içində.

**İSKAMYA, İSKƏMLƏ** [*fr.* "escabelle"-dən] *köhn.* bax **skamya**. *Bəli, Frebel üsulu ilə qayrılan məktəb iskamyalarını bir-iki dəqiqənin ərzində çəkdilər kənara.* C.Məmmədquluzadə. *Bir səhər bir müəllim məktəbin həyətində olan iskamyanın üstündə oturub hər iki tərəfinə almalar düzmüşdü.* "Məktəb". *Tələbələr yarımişıq daxmada rast gələn ilk iskəmlədə uzanıb yuxuya getdilər.* Çəmənzəminli.

**İSKƏLƏ** *is.* [*ital.*] Dənizdə, göldə gəmilərin yanaşması üçün körpü. *Qaraşəhər iskələsində yan-yana durmuş qayıqlar dolur, boşalırdı.* A.Şaiq. *Paroxodun hərəkətinə yarım saat qalmış* [Sarıköynəyi] *evdən alıb iskələyə gətirdim.* S.Hüseyn. // Bu cür körpüləri olan şəhər. *..Murmansk yalnız iskələ deyil, o, balıq və meşə sənayesi, dəri emalı, gübrə istehsalı ilə .. dünyada məşhurdur.* Mir Cəlal.

**İSKƏNCƏ** *is.* Xışı boyunduruqla birləşdirən ağac.

**İSKƏNCƏBİ** *is.* [*fars.*] Şirni ilə sirkənin qarışdırılmasından hazırlanan şərbət. *Hətta namaz vaxtı da mömin müsəlmanın fikri və zikri dolu olar iskəncəbi ilə, lumulu çay ilə.* C.Məmmədquluzadə. *Buzlu şərbət, iskəncəbi qonaqların sevimli içkiləri idi.* M.S.Ordubadi.

**İSKƏNƏ** *is.* Dayaz oyuqlar açmaq, kəsmək, yonmaq və təmizləmək üçün yastı polad alət.

**İSKƏNƏLƏMƏ** "İskənələmək"dən *f.is.*

**İSKƏNƏLƏMƏK** *f.* İskənə ilə oyuq açmaq, yaxud yonmaq.

**İSKƏNƏLƏNMƏ** "İskənələnmək"dən *f.is.*

**İSKƏNƏLƏNMƏK** *məch.* İskənə ilə oyuq açılmaq.

**İSKİTLƏR** bax **skiflər**. [Çopo:] *..Sərkərdəsiz iskitlər qoyun sürüsü kimidir.* Çəmənzəminli.

**İSLADILMA** "İsladılmaq"dan *f.is.*

**İSLADILMAQ** *məch.* İslaq hala gətirilmək, yaş edilmək.

**İSLADILMIŞ** *f.sif.* İslaq hala salınmış, yaş edilmiş. // Canına su və ya başqa maye hopdurulmuş.

**İSLAH** *is.* [*ər.*] Qüsur və nöqsanlarını aradan qaldıraraq yaxşı hala salma, yaxşılaşdırma, düzəltmə, yaxşılaşdırılma, düzəldilmə, düzəlmə. *Həzrət Əşrəf bilir ki, maarif, nəqliyyat, ziraət, ticarət və sair işlərimizin islaha böyük ehtiyacı vardır.* M.S.Ordubadi. *İndi ki sən gördün özün-özünü; İslah yolundasan, oğlan, sən demək.* B.Vahabzadə. □ **İslah etmək** – düzəltmək. [Qüdrət:] *Məncə, şərtlərdə qüsur yoxdur, qüsuru şəxsən özünüzdə axtarıb tapsanız və onu tezliklə islah etsəniz, həm biz qazanarıq, həm də siz.* M.Hüseyn. *Müəllimə fikrə gedir; Şagirdinə "iki" yazıb; Nöqsanını islah edir.* M.Dilbazi. **İslah qılmaq** *köhn.* – bax **islah etmək**. *Bari xudaya, özün islah qıl; Ta edələr pirü cavan sülh, sülh.* M.Ə.Sabir.

◊ **İslah evi** – cinayətkarları islah etmək üçün xüsusi yer; dustaqxana. *Bu danışıqdan sonra hökumət məmurları şəhərə döndülər, dustağı da şəhər islah evinə keçirdilər.* E.Sultanov. *İslah evi şəhərin bir kənarında, rayon milis idarəsinin yaxınlığında idi.* S.Rəhimov.

**İSLAHAT** *is.* [*ər.* "islah" söz. cəmi] Bir şeyi yaxşılaşdırmaq məqsədi ilə edilən əsaslı dəyişiklik. *Əlifba islahatı. Pul islahatı.* – *..Biz camaat işlərinə qatışıb islahat əmələ gətirmək istədikdə iki məqsədin dalına düşürük..* Ü.Hacıbəyov. *Rzaqulu xanın İranda başlamaq istədiyi islahat ən əvvəl öz atasından qalmış 60 para kəndlərindən başlandı.* M.S.Ordubadi. *Artıq burada biz bütün islahat və tərəqqi planlarında Azərbaycanın yad edildiyini görürdük.* M.İbrahimov.

◊ **İslahatdan düşmək** *dan.* – yararsız hala düşmək; kardan düşmək: yıpranmaq. *Ayaqqabı islahatdan düşüb. Pencək islahatdan düşüb. Əlcək islahatdan düşüb.* **İslahatdan salmaq** *dan.* – tamam korlamaq, yararsız hala salmaq, əldən salmaq. *Paltarını islahatdan salıb.*

**İSLAHATÇI** *is.* 1. İslahat aparan adam; reformator. [Rüstəm bəy:] *Lüter və Kalvin kimi din islahatçıları olmuş. Yeni din uyduran olmamışdır.* Çəmənzəminli. [Nərimanov] *Nadirin simasında öz dövrünün islahatçı qəhrəmanını yaratmağa çalışmışdır.* M.Arif.

2. İslahatçılıq (reformizm) tərəfdarı; reformist. *İslahatçılar qanadı.*

**İSLAHATÇILIQ** *is.* İnqilabi, sinfi, siyasi mübarizəni inkar edərək, xırda islahatla kifayətlənmə siyasəti; reformizm.

**İSLAHEDİCİ** *sif.* Düzəldən, yaxşılaşdıran, yaxşı hala salan. *İslahedici tədbirlər. İslahedici gülüş.*

**İSLAHEDİLMƏZ** bax **islaholunmaz**.

**İSLAHEDİLMƏZLİK** bax **islaholunmazlıq**.

**İSLAHXANA** [*ər.* islah və *fars.* xanə] bax **islah evi** ("**islah**"da).

**İSLAHOLUNMAZ** *sif.* İslah edilə bilməyən, düzəlməsi çətin olan. *İslaholunmaz adam.*

**İSLAHOLUNMAZLIQ** *is.* İslah edilə bilməmə, düzəldilə bilməmə; islah oluna bilməyən adamın hal və keyfiyyəti.

**İSLAHPƏZİR** *sif.* [*ər.* islah və *fars.* ...pəzir] *köhn.* İslah oluna bilən, düzəlməsi mümkün olan.

**İSLAQ** *sif.* Yaş, sulu, nəm, suda qalıb və ya üstünə su tökülüb islanmış. *İslaq paltar. İslaq torpaq. İslaq yarpaqlar.* – *Şən qəhqəhələrlə islaq otların arasından* [Aslan bəylə Qəmər] *çiyələk dərib yeyirdilər.* A.Şaiq. *Ayna islaq başını Ayazın döşünə qoydu.* Ə.Məmmədxanlı. // Suda qalıb yumşalmış. *İslaq gön. Gönü islağa qoymaq. Düyü islağa qaldı.*

**İSLAQLIQ** *is.* İslaq şeyin halı; yaşlıq, nəmlik, rütubətlilik.

**İSLAM** *is.* [*ər.*] VII əsrdə Məhəmməd peyğəmbər tərəfindən təsis edilmiş din; müsəlmanlıq. *..İslam dininin aydın əsas mətni olan Qurani-Məcid .. həm də tanınmış peyğəmbərlərin və kəramət başçılarının əhvalatını əhatə edir.* A.Ə.Axundzadə. // Müsəlman. *İslam aləmi.*

**İSLAMİYYƏT** *is.* [*ər.*] İslam dini; müsəlmanlıq. *Azərbaycanlılar hələ islamiyyətdən daha əvvəl .. öz azadlıq yollarında bitən maneələri məhv etməklə məşğul olmuşdu*(*lar*). M.S.Ordubadi. [Naşad:] *Bu, böyük*

*bir ixtiyardır ki, islamiyyət biz kişilərə vermişdi.* S.Hüseyn.

**İSLAMLIQ** *is.* İslam dininə mənsub olma; müsəlmanlıq. [Sönməz:] [Ərəblər] *xalqı .. islamlığa çevirir, iman gətirməyənin dilini kəsirlər.* C.Cabbarlı.

**İSLAND, İSLANDİYALI** *is.* İslandiya əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Danimarka ağalığı islandların milli inkişafını xeyli ləngitdi. İslandiyalılar Norveçdən köçüb gəlmiş qədim skandinaviyalıların nəsilləridir.*

**İSLANDCA** *sif.* və *zərf* İsland dilində. *İslandca danışmaq. İslandca kitab.*

**İSLANMA** "İslanmaq"dan *f.is.*

**İSLANMAQ** *f.* İslaq hala gəlmək. *Yağışa düşüb islanmaq. Suya düşüb islanmaq. – Əzizim, gülüstana; Şeh düşüb gülüstana; Qorxuram göz yaşımdan; Qoynunda gül islana.* (Bayatı). *Az keçdi, yenə güclü yağış başladı başdan; Bir anda bahar paltarım islandı yağışdan.* S.Rüstəm. *Saman və ot tayaları, qalın kol-kos, yaşıl ağaclar islandıqca, havanı xoş bir ətirlə doldururdu.* M.İbrahimov. // Suyun və ya başqa bir mayenin təsiri ilə yumşalmaq, sərtliyini, diriliyini itirmək, canına hopmaq. *Gəldiyev gələn kimi düyü islanar, qazan asılardı.* Mir Cəlal.

**İSLANMIŞ** *f.sif.* İslaq hala gəlmiş. *Anam gecəki yağışdan islanmış şeyləri Ayrım qızının köməyi ilə alaçıqdan çıxara-çıxara: – Allah kəssin belə yaylağı.* A.Şaiq. *Şehli çəmənlərdə qaçdığım anlar; Yadıma islanmış tellərim gəlir.* M.Dilbazi. *İsgəndər kişi tərdən islanmış dəsmalını dizinə sərmişdi.* İ.Hüseynov. // İs. mənasında. *məc. İslanmışın sudan nə qorxusu?!* (Məsəl).

◊ **İslanmış cücə kimi** – bütün su içində olan, üst-başı başdan-başa islanmış adam haqqında. *..Arıq adam islanmış cücə kimi büzüşüb danışdığına peşman oldu.* M.Hüseyn.

**İSLATMA** "İslatmaq"dan *f.is.*

**İSLATMAQ** *f.* 1. Yaş eləmək, islaq hala gətirmək. *İndi* [Xədicənin] *gözlərindən sakitcə axan yaşlar yanaqlarını isladıb axır... axır... bir dürlü bitmək bilməyirdi.* S.Hüseyn. *Çatıldı qaşların, darıldın mənə; İslatdı jalələr nazik bədəni.* Ə.Cavad. *Gözlərindən tökülən isti yaşlar isə onun açıq sinəsini islatdı.* H.Nəzərli.

2. Su çiləyib, su vurub yaşlatmaq, nəmlətmək. *Kərbəlayı Qulu usta Ağabalanın uzun papağını çıxartdı və başını su ilə islatdıqda bir neçə suallar elədi.* Çəmənzəminli.

3. İslanmaq üçün suya (və s. məhlula) qoymaq, suda saxlamaq. *Düyü islatmaq. Paltar islatmaq. – Böyük tabaqlara buğda töküb isladardılar.* H.Sarabski. *Qərənfil ilə Yasəmən çiyid islatmaq üçün kənddə qalmışdı.* Ə.Vəliyev.

4. *məc. dan.* Döymək, kötəkləmək, əzişdirmək. *Sair şeyxlər duyuq düşüb haman maralı lazımınca islatdılar.* Ə.Haqverdiyev. *Bir neçə dəfə biçarəni bu sayaq isladıb döydülər və döydükcə deyirdilər: – Əl çəkəcəksən bizim yaxamızdan?* E.Sultanov.

◊ **Boğazını islatmaq** – b a x **boğaz**[1].

**İSLIQ** *is.* Fit, fışqırıq. *Ancaq .. gəmilərin son islıqları .. eşidilirdi.* M.S.Ordubadi. *Düşmən tərəfdən gələn güllələr islıq çala-çala başı üzərindən uçuşur.* H.Nəzərli. *Hər baxışda bir sevinc; Hər dodaqda bir islıq.* M.Müşfiq. *Birdən şəhərli papağının dalını qaldıraraq islıqda "Çobanı" çalmağa başladı.* İ.Əfəndiyev.

**İSMARIŞ** *is.* Tapşırıq. *Aşıq sazla dediyi kimi, sözlə də Məhbub xanımın ismarışını Koroğluya yetirdi.* "Koroğlu". *Padşah zənəninə ismarış göndərir ki, hələ bir neçə vaxt qalsın orda, uşağın bir sümüyü bərkisin, gələr, gənə bir qəzavü qədər üz verər.* (Nağıl). // Sifariş.

**İSMARLAMA** "İsmarlamaq"dan *f.is.*

**İSMARLAMAQ** *f.* 1. Tapşırmaq. *Dəvənin dizini bağla, Allaha ismarla.* (Ata. sözü). *Rəhmətlik son nəfəsində əllərimi tutub dedi: – Gülcahan, Əşrəfi sənə, səni də Allaha ismarladım..* A.Şaiq. *Bir söz ismarlamış bəlkə yar eli; Nədən anlaşılmaz quşların dili?* Ə.Cavad.

2. Sifariş etmək, bir şey etməyi tapşırmaq. *Dərziyə bir palto ismarladım. – Həsən qulluqçunu çağırdı, çay ismarladı.* Çəmənzəminli.

**İSMARLANMA** "İsmarlanmaq"dan *f.is.*

**İSMARLANMAQ** *məch.* Tapşırılmaq. // Sifariş edilmək.

**İSMARLATMAQ** "İsmarlamaq"dan *icb.*

**İSMƏT** *is.* [*ər.*] Namus, irz, həya, abır, pərdə. *Arvadın isməti, ərin izzəti.* (Ata. sözü). *Qorxum bu ki ismət ola pamal; Fərmanə müvafiq olmaya hal.* Füzuli. [Gövhər xa-

nım:] *..İndiyədək abır, ismət saxladıb məni..* N.Vəzirov. [Hatəmxan ağa:] *Heç sənə müsəlmanın ismətinə toxunmaq yaraşırmı?* Ə.Haqverdiyev. // Məsumluq, təmizlik.

**İSMƏTLİ** *sif.* Namuslu, həyalı, abırlı, əxlaqlı, təmiz, məsum. – *Gülzarın namuslu və ismətli* (z.) *olduğu xüsusi bir tərzdə dillərdə dolaşırdı.* C.Cabbarlı. *Zəmanənin xarab bir vaxtında nəcib, gözəl, həyalı, iffət və ismətli bir qız tapmaq çox da asan deyildi.* S.Hüseyn. *Hakim təbəqələr pul və dövlət gücünə harınlıq edərək nə qədər ismətli və həyalı ailələri dağıtmışlar.* M.İbrahimov.

**İSMƏTLİLİK** *is.* Namusluluq, həyalılıq, abırlılıq, əxlaqlılıq, əxlaq təmizliyi. // Məsumluluq, günahsızlıq.

**İSMƏTSİZ** *sif.* İsmətini itirmiş, namussuz, abırsız, həyasız, şərəfsiz, üzündə pərdə olmayan. *..Mənim sözüm budur ki, ümumiyyətlə, heç bir millətin barəsində demək olmaz ki, filan millətin övrətləri bietibar və ismətsizdir.* "Mol. Nəsr.".

**İSMƏTSİZLİK** *is.* İsməti, abırı, həyası olmama; abırsızlıq, həyasızlıq.

**İSNAD** [*ər.*]: **isnad etmək (vermək)** – bir şeyi bir şəxsə və ya bir yerə və s.-yə aid etmək, nisbət vermək, bağlamaq; üstünə atmaq mənalarını bildirir. *Zülfi-müşkininə dil verdim, o, qanım tökdü; Bu xəta düşdü özündən, mənə isnad etdin.* S.Ə.Şirvani. *İki tərəf bir-birinə olmazın böhtan və iftirasını, olmazın həyasız hərəkətlərini isnad verirdilər.* Çəmənzəminli.

**İSNADƏN** [*ər.*] *köhn.* ...əsasən, ...görə, isnad edilərək. *Alınan xəbərlərə isnadən... Əldəki sənədlərə isnadən demək olar ki...*

**İSPAN** *is.* İspaniyanın əsas əhalisini təşkil edən, roman dillərindən birində danışan xalq və bu xalqa mənsub adam. *İspan musiqisinin janr xüsusiyyətləri. İspan ədəbiyyatının görkəmli nümayəndələri. İspan dilinin ilk qrammatikası 1492-ci ildə yaradılmışdır.*

**İSPANAQ** *is. bot.* Qısa yeməli yarpaqları olan birillik tərəvəz bitkisi. *İspanaq iki növdür: ev və vəhşi* (*çöl*) *halda bitən ispanaq. İspanaqları ətə qatıb, müxtəlif xörək bişirməyə sərf edirlər.* A.Quliyev.

**İSPANCA** *sif.* və *zərf* İspan dilində. *İspanca kitab. İspanca-latınca lüğət. İspanca danışmaq.*

**İSPANİYALI** *is.* İspaniya əhalisindən olan, İspaniya vətəndaşı.

**İSPÁNKA** [*rus.*] *tib.* 1918-1919-cu illərdə əvvəlcə İspaniyada baş verib, sonralar başqa ölkələrə yayılmış qrip xəstəliyinin bir növü.

**İSPOLKÓM** [*rus.* исполнительный комитет söz. ixtisarı] *tar. dan.* İcraiyyə komitəsi (canlı dildə bəzən həmin komitənin sədri mənasında). [Qızyetər:] *A Fatmanisə, nə olar gedib bir ispolkoma xəbər verib, onlardan bir səhih əhval alasan.* Ə.Haqverdiyev. [Kəndli:] *Dedim heç belə bir iş olmaz, getdim nahiyəyə, ispolkoma dedim, dedi ərizə ver.* T.Ş.Simurq.

**İSRAF** *is.* [*ər.*] Artıq və lazımsız yerə xərcləmə, sərf etmə, işlətmə, dağıtma, puç etmə. *İsraf haramdır.* (Ata. sözü). *Atasının bu qədər yersiz israfı və belə faciəli ölümü Əşrəfi çox düşündürürdü.* A.Şaiq. *Yoxlama zamanı Toğrulun xəzinədən israf xərclədiyi və qiymətli şeyləri mənimsədiyi meydana çıxdı.* M.S.Ordubadi. // **İsrafla, israf ilə** şəklində – artıqlaması ilə, artıq olaraq. *Sərf etdi ciyər qanını israf ilə çeşmim; Bilməz ki, bu gün qanla pərişan olacaqdır.* Qövsi. ☐ **İsraf etmək (eləmək)** – 1) artıq və lazımsız yerə sərf etmək, xərcləmək, işlətmək, dağıtmaq. *Belə məlum olur ki, israf eləyirsiniz. Yoxsa mən heç vaxt inana bilmənəm ki, bir boçka su əlli iki nəfər fəhləyə kifayət eləməyə.* C.Məmmədquluzadə; 2) özünə inanılıb tapşırılmış pulu, malı və s.-ni qanunsuz olaraq öz şəxsi məqsədləri üçün xərcləmək, sərf etmək.

**İSRAFCIL** bax **israfçı** 1-ci mənada.

**İSRAFCILLIQ** bax **israfçılıq** 1-ci mənada.

**İSRAFÇI** *is.* 1. İsraf edən, israfa yol verən; bədxərc.

2. Özünə inanılıb tapşırılmış pulu, malı və s.-ni israf edən adam.

**İSRAFÇILIQ** *is.* 1. İsrafa yol vermə, artıq və lazımsız yerə xərcləmə, dağıtma. *İsrafçılıq etmək.*

2. Özünə inanılıb tapşırılan pulu, malı və s.-ni israf etmə, öz məqsədləri üçün xərcləmə, sərf etmə. *Balacayevi böyük bir dəhşət bürüdü. Onun boynuna üç təqsir sarınmışdı – "saxtakarlıq, israfçılıq və qatillik!"* S.Rəhimov.

**İSRAĞAGÜN** *zərf* Srağagün. [Şəhrəbanı xanım:] *İsrağagün aşnası zərdablı Qurban bəyə kağız yazırdı ki, Şamaxı cəngilərinin vədəsini alsın, toya göndərsin.* M.F.Axundzadə. [Ana:] *İsrağagün də aləmi gəzdim, bir çimdik çay tapa bilmədim.* S.Rəhman.

**İSRAĞAGÜNKÜ** *sif.* Srağagün olmuş (baş vermiş). *İsrağagünkü hadisə.*

**İSRAİLLİLƏR** *is. tar.* 1. Qədim yəhudi tayfalarının ümumi adı. *İsraillilərin çoxu Assuriyanın uzaq əyalətlərinə köçürülmüşdü.* – [Xanburabi:] *İsraillilər .. Yeqovu .. yaradılışın ağası zənn edirlər.* Çəmənzəminli.

2. İsrail dövlətinin əhalisi.

**İSRAR** [*ər.*] 1. *is.* Dediyi sözün, tələb etdiyi şeyin, irəli sürdüyü fikir və ya iddianın üstündə durma, təkid göstərmə, dediyindən dönməmə; inad, təkid. *Bəsdir, dəxi millət qəmini eyləmə təkrar; Olmaz belə israr!* M.Ə.Sabir. *Rəmziyyə nə qədər danışdısa, Əhməd qəbul etməyib israrında davam etdi.* A.Şaiq. *Məhkəmənin israrına görə Molla Xəlil etiraf etdi ki, qadını gözü ilə görməmiş, fəqət qulağı ilə eşitmişdir.* S.Hüseyn. ☐ **İsrar etmək** – dediyi sözün, tələb etdiyi şeyin, irəli sürdüyü fikir və ya iddianın üstündə durmaq, dediyindən dönməmək, təkid göstərmək. [Bəhram:] *Pəri!.. Elə bil ki, bir qulluqçudur, evdə saxlamısınız, fəqət israr edirsənsə, əlbət ki, sözünü sındırmıram.* C.Cabbarlı. *Qadınlar eylədi sözündə israr; Töküb göz yaşını, qıldı ah-zar.* H.K.Sanılı.

2. **İsrarla** şəklində *zərf* – təkidlə, inadla. *Kimdən şübhələnirsiniz? – deyə jandarm zabiti israrla soruşdu.* M.Hüseyn.

**İSRARLI** *sif.* Sözünün üstündə israr edən, dediyindən dönməyən; inadlı.

**İSRİF** *is. məh.* Qənaətçilik, haqq-hesabını bilmək.

**İSSIZ** *sif.* Heç bir insan yaşamayan, əhalisiz, boş, xali, şenliksiz. [Knyaz:] *Həp düşündükcə boğar ruhu soyuq; Qaba, issız və dərin bir boşluq.* H.Cavid. *Səhərə yaxın issız və səssiz aləm oyanmağa başlayır.* M.S.Ordubadi.

**İSSIZCA** b a x **issız.** [Gənc çadırçı:] *O parlaq möhtəşəm kaşanələrdən; Bu gün issızca bir viranə qaldı.* H.Cavid.

**İSSIZLIQ** *is.* Boşluq, xalilik, adamsızlıq, tənhalıq.

**İSSİLIQ** *is. məh.* Yayda istinin təsirindən bədəndə əmələ gələn qırmızı səpgi, qızartı. *İssilıq tutmaq.*

**İSTEDAD** *is.* [*ər.*] 1. Fitri qabiliyyət, bir şeyi tez mənimsəmə qabiliyyəti; zəka, talant. *Şairlik istedadı.* – *Ey Füzuli, müttəsil dövran müxalifdir mana; Qaliba ərbabi-istedadı dövran istəməz.* Füzuli. [Fitnə:] *Dünyada istedad, hər böyük hünər; Daima vərdişlə inkişaf edər.* A.Şaiq.

2. İstedadlı adam, istedad sahibi. *Bəşərin ən böyük istedadları elmdə Tanrının yaratdıqlarının ifadəsini görmüşlər.* – [Aydın:] *Ancaq Vurğunun bir misrasını yazmaq üçün gərək onun kimi nadir istedad olasan.* M.Hüseyn.

3. Bir şeyi etmək imkanı, bacarığı; qabiliyyət. *İstedadı çatmamaq.* – *Sanki* [Murad] *vətəndaşlıq hüququnu itirmiş, yaşamaq istedadını qeyb etmişdi.* S.Hüseyn.

**İSTEDADLI** *sif.* İstedadı, fitri qabiliyyəti olan; talantlı. *İstedadlı bəstəkar.* – *Azərbaycan mətbuatı tarixində* [C.Məmmədquluzadə] *böyük və istedadlı bir jurnalistdir.* M.İbrahimov. [Direktor:] *İstedadlı gəncləri yetişdirmək lazımdır.* İ.Əfəndiyev. // Hər şeyi tez qavrayan, tez əxz edən. *İstedadlı uşaq.* – *Varis aşağı siniflərdə ciddi və istedadlı bir şagird kimi görünürdü.* A.Şaiq.

**İSTEDADLILIQ** *is.* İstedadlı adamın hal və keyfiyyəti. *Onun istedadlılığına söz ola bilməz.*

**İSTEDADSIZ** *sif.* İstedadı olmayan. *İstedadsız adamlar onsuz da özlərinə yol tapırlar.*

**İSTEDADSIZLIQ** *is.* İstedadı, qabiliyyəti, bacarığı olmama; qabiliyyətsizlik, bacarıqsızlıq.

**İSTEFA** *is.* [*ər.*] Öz xoşu ilə vəzifəsindən, işindən çıxma, əl çəkmə. *Mitinqçilər istefa tələb edirlər.* ☐ **İstefa vermək, istefaya çıxmaq** – öz xoşu ilə vəzifəsindən, qulluğundan əl çəkmək, çıxmaq. [Almaz:] *Mən deyərdim ki, bir vətəndaş kimi* [Baloğlan] *öz nöqsanlarını bilib istefa versin.* C.Cabbarlı. *İblisi cəhənnəm əhli bir növ cana gətirmişdi ki, binəva az qalmışdı, istefa verib qulluqdan çıxsın...* Ə.Haqverdiyev.

**İSTEFALI** *sif.* İstefada olan, istefa vermiş. *İstefalı general.*

**İSTEHKAM** *is.* [*ər.*] *hərb.* Düşməndən qorunmaq məqsədi ilə düzəldilən səngər, sədd, qala, divar və s. müdafiə tikintiləri. *Sahil istehkamları. İstehkamda gizlənmək. – Ay buludun arxasında gizlənmiş, istehkam boyu bir çox kölgələr səssiz-səmirsiz gəzinirlər..* H.Nəzərli. [Naçalnik:] *Dostum, qoy sənintək vuruşsun hamı; Əldən buraxmayın bu istehkamı!* S.Rüstəm. □ **İstehkam hissəsi** – istehkamçılardan ibarət hərbi hissə. *İstehkam hissəsi səngər qazırdı. – İstehkam hissələrinin əlində kifayət qədər vəsait olmurdu.* Mir Cəlal.

**İSTEHKAMÇI** *is. hərb.* İstehkam hissələrində qulluq edən hərbi xidmətçi; istehkam qurma mütəxəssisi. // İstehkam işləri ilə məşğul olan, istehkam hissəsində qulluq edən. *.. İstehkamçı zabitin, nəsə inşaat mütəxəssisi olduğunu zənn edir, öz yanına işə çağırmağa çalışırdı.* Mir Cəlal.

**İSTEHKAMLI** *sif.* Müdafiə üçün istehkamları, lazımi hərbi tikintiləri olan. *İstehkamlı yer. İstehkamlı sahil.*

**İSTEHLAK** *is.* [*ər.*] Tələbatı, ehtiyacı təmin etmək üçün işlətmə, sərf etmə, istifadə etmə, işlədərək sərf etmə, yox etmə. *İctimai istehlak fondları.* □ **İstehlak etmək** – ehtiyacı, tələbatı təmin etmək üçün işlətmək, sərf etmək, istifadə etmək.

◊ **Əmtəənin istehlak dəyəri** *iqt.* – əmtəənin alıcının bu və ya digər ehtiyacını ödəmə qabiliyyəti. **İstehlak kooperasiyası** – istehlak ehtiyaclarını təmin edən kooperasiya.

**İSTEHLAKÇI** *is. iqt.* 1. Hər hansı istehsalatın məhsulundan istifadə edən, bu məhsulatı işlədən şəxs və ya təşkilat.

2. Alıcı. *Geniş istehlakçı kütləsi.*

**İSTEHSAL** *is.* [*ər.*] Hasil etmə, hazırlama, əldə etmə. *Elektrik enerjisi istehsalı. Çuqun istehsalı. Maddi nemətlər istehsalı. İstehsalın ictimai xarakteri.* □ **İstehsal etmək** – hasil etmək, hazırlamaq. **İstehsal qüvvələri** – maddi nemətlərin istehsalına xidmət edən alətlər, istehsal alətlərini hərəkətə gətirən və maddi nemətlərin istehsalını həyata keçirən insanlar. **İstehsal müəssisəsi** – zavod, fabrik, karxana. *Mən də bir ağacın kölgəsində oturub, o böyük istehsal müəssisəsinə baxır, onun keçmiş halı ilə indiki halını müqayisə edirdim.* S.Hüseyn. **İstehsal münasibətləri** – maddi nemətlərin ictimai istehsalı prosesində insanlar arasında əmələ gələn münasibət və əlaqələr. **İstehsal vasitələri** – istehsal prosesində işlədilən, onun maddi əsasını təşkil edən vasitələr. [Almaz:] *..Buna görə də əmək kollektivləşməli və istehsal vasitələri kollektivin əlində olmalıdır.* C.Cabbarlı.

**İSTEHSALAT** *is.* [*ər.*] 1. Sənaye müəssisəsi, fabrik, zavod, karxana və s. *İstehsalatda çalışmaq. İstehsalat qabaqcılları. – İstehsalatda usta sözü kəsərli sözdür.* Mir Cəlal. // İstehsalatla bağlı olan. *İstehsalat təlimi. İstehsalat təcrübəsi. İstehsalat müşavirəsi.*

2. İstehsal olunan şeylər, hasil edilən mallar, məhsullar, məhsulat.

**İSTEHSALATÇI** *is.* İstehsalatda işləyən şəxs. *Yaxşı istehsalatçı. İnstitutun axşam şöbəsinə xeyli istehsalatçı qəbul edilmişdir.*

**İSTEHSALÇI** *is.* İstehsal edən, hazırlayan adam.

**İSTEHZA** *is.* [*ər.*] 1. Ələ salma, rişxənd etmə, masqaraya qoyma; masqara. *Tövsiyənin son cümləsində qürurdan çox incə bir istehza duyulurdu.* M.Hüseyn. *Tahirzadənin üzündə istehzanı andıran bir təbəssüm oynadı.* Mir Cəlal. *Qoca sanki öz acı istehzasından özü kövrələrək yaşarmış gözlərini kənara çevirdi.* Ə.Məmmədxanlı. □ **İstehza etmək** – ələ salmaq, masqara, rişxənd etmək. *Ona elə gəldi ki, məktəbə götürmək əvəzinə bu adamlar ona və onun anasına istehza edirlər.* S.Rəhman. **İstehzaya qoymaq** – b a x **istehza etmək**. *Tahir .. briqadanı bir həftədən çox işsiz gəzməyə məcbur eləyənləri istehzaya qoyurdu.* M.Hüseyn. **İstehzaya salmaq** – istehza üçün hədəf etmək. *Rzaqulu xan Böyükxanıma acıqlanıb deyirdi: – Məni bu firəng uşaqlarının istehzasına salma.* M.S.Ordubadi.

2. "ilə" qoşması ilə – ələ salaraq, rişxəndlə, masqara ilə. *İstehza ilə gülmək. İstehza ilə cavab vermək.* – [Rəşid:] *Mən istehza ilə danışmaq fikrində deyiləm.* H.Nəzərli. [Zabit] *kibrit sönən kimi balıqçı paltarında olan adamları bir də istehza ilə süzərək əli ilə işarə etdi.* Q.İlkin. *Sultan acığını güclə boğaraq istehza ilə qımışdı.* İ.Hüseynov.

**İSTEHZAEDİCİ** b a x **istehzalı**.

**İSTEHZALI** *sif.* İstehza bildirən, istehza ifadə edən. *İstehzalı söz. İstehzalı gülüş.* – *Kənardan İblisin mənalı və istehzalı qəhqəhələri eşidilir.* H.Cavid. *..Dodaqları ucunda istehzalı bir təbəssüm göründü.* H.Seyidbəyli.

**İSTEHZAYANA** b a x **istehzalı**. *Sitarə .. hələ bir qədər istehzayana nazlarla Mansurun yaralarına duz səpirdi.* C.Cabbarlı.

**İSTEMAL** *is.* [*ər.*] İşlətmə, istifadə etmə, tətbiq etmə. [Mirzə:] *On gün ki siz dərman istemalına məşğul olacaqsınız, o gərək gecə və gündüz sizin yanınızda olsun.* Ə.Haqverdiyev. □ **İstemal etmək** – işlətmək, istifadə etmək, tətbiq etmək. [Mirzə:] *Sabah dərmanı özünüzlə götürüb apara bilərsiniz və orada axund Ağa mollanın təhti-tərbiyəsində istemal etməyə məşğul olarsınız.* Ə.Haqverdiyev. **İstemal olunmaq (edilmək)** – işlədilmək, istifadə edilmək, tətbiq edilmək. *O yerdə ki söz düşəndə gərək "millət" sözü danışıla, orada "əşxas" ləfzi istemal olunur.* C.Məmmədquluzadə.

**İSTÉRİK** [*yun.*] b a x **isteriyalı**. *İsterik boğulma. İsterik pozğunluqlar.*

**İSTÉRİKA** [*yun.*] Qıc olma, bəzən gah gülmə, gah ağlama şəklində təzahür edən ürəkkeçmə.

**İSTERÍYA** [*yun.* hystera – uşaqlıq] *tib.* Psixika, hərəkət sferası, həssasiyyət və s. cəhətdən bir sıra müxtəlif pozğunluqlar şəklində təzahür edən funksional əsəb xəstəliyi. *İsteriyada hərəki, senzor, vegetativ və psixi pozğunluqlar qeyd olunur.*

**İSTERİYALI** *sif.* İsteriya xəstəliyi olan. *İsteriyalı adamlar əmək fəaliyyətini itirmirlər.*

**İSTƏDİKCƏ** *zərf* Doyunca, ürəyi istəyən qədər.

**İSTƏK** *is.* Arzu, dilək, murad; yerinə yetirilməsi (başqası tərəfindən) arzu edilən şey. *İstək gözdə olar.* (Məsəl). [Şeyx Sənan:] *İstəyim yalnız iştə bir şəfqət; Bir təbəssüm o hüsni-dilbərdən.* H.Cavid. *İstəyim xalqıma hər an ucalıqdır, ucalıq; Mənə yaddır qocalıq.* S.Rüstəm. *Sanki cavanlaşdı yüz il bədənim; Gözümdə qalmadı istəyim mənim.* Z.Xəlil. □ **İstəyinə çatmaq** – arzusuna, muradına çatmaq, istədiyinə, arzu etdiyinə nail olmaq. **Öz istəyi ilə** – öz arzusu ilə, öz xoşu ilə, öz könlü ilə.

**İSTƏKAN** [*rus.*] Stəkan. *Dərviş bir-iki istəkan çay içəndən sonra mənim sualıma cavab verdi.* A.Divanbəyoğlu. *Böyükxanım şad və xürrəm gümüş podnos içində iki istəkan kəmrəng çay gətirmişdi.* M.S.Ordubadi. *Mahirə istəkanı irəli çəkdi, çayını içdi.* M.Hüseyn.

**İSTƏKLİ** 1. *is.* Sevgili. [Fərman:] *Ata, mənə dövlət lazım deyil, .. mənə ancaq öz istəklim lazımdır.* Ə.Haqverdiyev. [Səriyyə:] *Neçə illər idi ümid edir idim ki, gələcəkdə Rüstəm əmim oğlu istəklim ilə bəxtiyar yaşayacağam.* C.Cabbarlı. *Gül ey doğma Vətənimin; İstəklisi, yetirməsi; Oyna, sevin, biz dinləyib; Fərəhlənək bu şən səsi.* M.Dilbazi.

2. *sif.* Əziz, sevimli, mehriban, ən çox istənilən. *İstəkli adam. İstəkli övlad.* – *Qaşların qarasından; Xal düşüb arasından; Adam da əl çəkərmi; İstəkli balasından?* (Bayatı). *Yazıq qızcığaz istəkli dostu Qaraca qızla görüşə bilmədi.* S.S.Axundov. *Varaz istəkli oğlunun çox ağıllı bir gənc olduğunu yaxşı bilirdi.* M.Hüseyn.

**İSTƏKLİLİK** *is.* İstənilmə, sevilmə; sevgi münasibəti.

**İSTƏKSİZ** *zərf* 1. Könülsüz, istəmədən, həvəssiz. *İstəksiz getmək. İstəksiz danışmaq.*

2. Məhəbbətsiz.

**İSTƏKSİZLİK** *is.* Könülsüzlük, könüldə istək olmaması; məhəbbətsizlik.

**İSTƏMƏ** "İstəmək"dən *f.is.*

**İSTƏMƏDƏN** *zərf* İstəmədiyi, arzu etmədiyi halda; ürəksiz, könülsüz. *İstəmədən almaq. İstəmədən getmək.* // Qeyri-iradi, özü istəmədən, istəməyərək.

**İSTƏMƏK** *f.* 1. Arzu etmək, ürəyindən keçirmək, bir şeyin qəsd və niyyətində olmaq, ürəyində bir istək duymaq. – *Bala, mən gördüm ki, sən bir yeniyetmə yaxşı oğlansan, istədim sənə maya verəm..* "Koroğlu". *İstəyir cənnəti zahid bu qədər hiylə ilə; Əbləhin fikrini gör, dildə təmənnasına bax!* S.Ə.Şirvani. [Süleyman:] *Əsgərin dediyi odur ki, səninlə qohum olmaq istəyir.* Ü.Hacıbəyov. // Bir şeyə ehtiyac hiss etmək. *Ürəyim yaman su istəyir. Bir məqalə yazmaq istəyirəm. Ondan bir xoş söz eşitmək istəyirəm.* □ **İstədiyi kimi** – özü bildiyi kimi (həm müsbət, həm mənfi mənada işlənir). *İstədiyi kimi hərəkət etmək.*

2. Sevmək, məhəbbət yetirmək, əzizləmək. *Ana oğlunu çox istəyir.* [Nazlı:] *Ana, axı sən bilirsən, mən Sara bacımı nə qədər istəyirəm.* C.Məmmədquluzadə. *Deyə bilərəm, Usta Ağabala Axund Ələsgər ağanı dünyada hamıdan çox istəyirdi.* Çəmənzəminli. *Gözəl Bayramı istəyib gəlmişdi. O, kasıb olsa da, namuslu oğlandı.* M.Hüseyn. // Ummaq. *Könül istər, əl çatmaz.* // Qeydinə qalmaq, sevmək. *Məsləkini istəyən öz canından keçməli; Öz canını istəyən vicdanından keçməli.* B.Vahabzadə.

3. Xahiş etmək, rica etmək, təmənna etmək. *Novruz gözlərini ovuşdura-ovuşdura açıb: – Nə var, nə istəyirsiniz? – deyib sual etdi.* N.Nərimanov. [Əsgər:] *Deyin görüm, gözəl xanımlar, nə istəyirsiniz.* Ü.Hacıbəyov. // Özünə verilməsini və ya bir işin görülməsini söyləmək; tələb və ya xahiş etmək. *Ondan bir şey istədik, vermədi. – Həkim Cinayətov haqq-hesab dəftərçəsini istədi.* Mir Cəlal. // Möhtac olmaq, lüzum və ehtiyac hiss etmək, tələb etmək. *Əkin su istəyir.* // Diləmək. *İmdad istəmək. Yardım istəmək. – Kimə kim, dərdimi izhar qıldım, istəyib dərman; Özümdən həm bətər bir dərdə onu mübtəla gördüm.* Füzuli.

4. Çağırmaq, çağırtdırmaq. *Yusif şah baxıcıları hüzuruna istəyib dedi ki: – Hakimi-vilayətlərə mənim tərəfimdən elan edərsiniz ki, .. xalqı talayıb-dağıtmasınlar.* M.F.Axundzadə. [Xudayar bəy:] *Məhəmmədhəsən əmi, tez oğlanı göndər, pəyədən eşşəyi çıxartsın, .. minəcəyəm şəhərə, nəçərnik istəyibdir.* C.Məmmədquluzadə. // Aramaq, axtarmaq, soruşmaq. *Kimi istəyirsiniz? Telefonla sizi istəyirlər.*

5. Öz adamına almaq, evləndirmək üçün (yaxud özü üçün) xahişlə birinə müraciət etmək. *Qohumdan qız istəmək. Ana oğlu üçün qız istəyir.* – [Ağcaxanım:] *Qədeş!.. Bizim qızı Hacı Abtalıbın oğlu üçün istəyirlər.* H.Sarabski.

6. "Bir" sözü və şəxs sonluqları ilə tərəddüd, qətiyyətsizlik bildirir. *Bir istədim durub gedəm. Bir istədim durub ona cavab verəm.* – [Mehriban] *bir istədi ki,* [Zeynalı] *çəkib irəli sürüsün, gücü çatmadı.* S.Hüseyn.

7. **İstəməz** şəklində – hacət yoxdur, lüzumu yoxdur, ehtiyac yoxdur, bəsdir, kifayətdir. [Səlimə:] – *Ay Qurban, gəlsənə bir az su gətirim, ayaqlarını yuyum. – İstəməz, lazım deyil.* Ə.Haqverdiyev. [Səlim:] *İstəməz başqa laf! Söylə, açıq söylə, hər nə var, söylə.* H.Cavid.

◊ **...istər ki...** – 1) istərsə, fərqi yoxdur, qoy lap... *İstər ki çölə töksün...*; 2) ...gərəkdir, ...haradadır. *Oğul istər ki...* **istəməz ki...** – heç olmasa...

**İSTƏMƏLİ** *sif.* İstənilməyə, sevilməyə layiq; xoşqılıq, mehriban, üzügülər; qanışirin. *İstəməli qız. İstəməli uşaq. – Lap üç-dörd yaşından bu şirindilli, istəməli qızın ayağı karxanaya açılmış, usta ilə dostlaşmağa başlamışdı.* Ə.Əbülhəsən.

**İSTƏNİLMƏ** "İstənilmək"dən *f.is.*

**İSTƏNİLMƏK** "İstəmək"dən *məch.*

**İSTƏNMƏ** "İstənmək"dən *f.is.*

**İSTƏNMƏK** b a x **istənilmək**.

**İSTƏR** *bağl.* Sintaktik vəzifəsinə görə həm həmcins üzvləri, həm də cümlələri bir-birinə bağlayır – gərək, həm. [Səlim:] *Orxan, istər xan olsun, istər sultan; Haqsızlıq əfv olunmaz heç bir zaman.* H.Cavid. [Zeynal] *istər evdə, istər tanış-bilişlərin məclislərində tar çalar, eyni zamanda özünün yazdığı şeirləri oxuyardı.* S.Hüseyn. *İstər "Əhvalatlar", istərsə "Poçt qutusu" dərin ideyalı, yüksək sənət əsərləridir.* M.İbrahimov. *İstəyirdim ki, birisi ilə oturub dərdləşəm, istəyirdim ki, – istər tanış olsun, istər qeyri-tanış, – hamıya söz deyib söz eşidəm...* Ə.Məmmədxanlı. // "Fərqi yoxdur" mənasında. *İstər gəlsin, istər gəlməsin.*

**İSTƏR-İSTƏMƏZ** *zərf* Yarımkönül, ürəksiz, könülsüz, özü istəmədiyi halda, istəmədən. [Gülbadam] *ağ donunu geyindi, əsnədi, istər-istəməz ayağa durdu.* N.Nərimanov. *Fatma .. istər-istəməz uşaqlara izin verdi.* S.S.Axundov. *Mehriban istər-istəməz ayağa qalxıb yerini Cəmiləyə verdi.* H.Seyidbəyli.

**İSTƏTMƏ** "İstətmək"dən *f.is.*

**İSTƏTMƏK** *icb.* Bu və ya başqa bir vasitə ilə bir şeyi başqasına sevdirməyə çalışmaq; birinin hüsn-rəğbətini, sevgisini qazanmağa çalışmaq. *Güclə özünü istədə bilməzsən.*

**İSTƏYƏ-İSTƏMƏYƏ** b a x **istər-istəməz**. *İstəyə-istəməyə getməli oldu. – Mehriban istəyə-istəməyə razı oldu.* S.Hüseyn.

**İSTİ** 1. *sif.* Qızdırılmış, isidilmiş, hərarəti artırılmış (*soyuq* qarşılığı). *İsti otaq. İsti ütü. İsti süd. – Hənifə bir əlində tas, o biri əlində isti su ilə dolu vedrə və dolça, tövşüyə-tövşüyə içəri girdi.* İ.Hüseynov.

2. *is.* Xəstəlik halında bədəndə yaranan hərarət, istilik. *Xəstənin istisi qalxmışdır. – İstisini ölçüb dərhal; Ana deyir: – Dincəl bir az.* M.Dilbazi. [Salama] *elə gəldi ki, sinəsindən isti qalxır..* Mir Cəlal.

3. *sif.* İstilik verən, yandırıcı, qızğın. *İsti günəş. İsti şüa. – ..Turab Xəzər dənizindən qalxan od kimi isti günəşdən yorğun gözlərini açdı.* M.Hüseyn. *Əsla məni döyməsin; İsti günəş, sərt külək.* Z.Xəlil. // Hava haqqında. *İsti gün. İsti hava. – Nə gözəldir dolaşmaq isti yay fəsilləri; Bu sərin sahilləri.* M.Müşfiq. *Avqustun ortaları olduğundan hava çox isti idi.* İ.Əfəndiyev. *İsti yay günləri də Tapdığın intizarını anlayıb tez gəlib keçdi.* Ə.Vəliyev. // Mülayim iqlimi olan. *İsti ölkələr* (cənub ölkələri). // *is.* Bərk qızmış hava; hərarət, istilik. *Heç kəs nə qapıda, nə küçənin bir yanında görünmür. Yəqin ki, istinin zərbindən hərə bir kölgə yerə pənah gətirib.* C.Məmmədquluzadə. [Məşədi Qəzənfər:] *Yazın istisində harada sərinləyə bilərsən?* Ü.Hacıbəyov. *Dözülməz isti insanı taqətdən salırdı.* Ə.Sadıq. // Cəm halında: **istilər** – havanın qızmağa başlaması. *İstilər düşdü. İstilərin başlanmasına az qalıb. – İstilər düşdükcə başını qaldırıb canlanmış cürbəcür həşarat və milçəklər bu gecə sanki qəsdən daha çox fəaliyyət göstərirdi.* M.İbrahimov.

4. *sif.* Bədəni soyuqdan yaxşı qoruyan; yun. *İsti köynək. İsti paltar. İsti corab. – Gecələr yatmayıb hər bir qoçağa; İsti paltar tikdi gəlinlər, qızlar.* S.Vurğun. [Zəhranın] *ayağında dizdən əsgər çəkməsi, başında isti papağı vardı.* Ə.Vəliyev.

5. *sif. məc.* Hərarətli, mehriban, nəvazişli, oxşayıcı, səmimi. *Şux səslərlə dolu isti yuvalar; Daşqın çaylar, durğun göllər bizimdir..* A.Şaiq. *Bircə nöqsan tapmayaraq övladının varlığında; Bir can kimi bəsləmişdir məni isti qucağında.* S.Rüstəm. [Gülcamal:] *Məmmədin səsinə oxşayır bu səs; Onun nəfəsidir bu isti nəfəs!* Z.Xəlil.

◊ **İsti basmaq** – bir işdən, sözdən, hadisədən və s.-dən çox mütəəssir olub özünü istilənmiş kimi hiss etmək. **İsti çalmaq** – b a x **isti basmaq**. *Bu səsdən məni bir isti çaldı, hərarət bütün bədənimi mum kimi yumşaltdı.* Mir Cəlal. **İsti vurmaq** – günəşin şiddətli təsirindən süstləşmək, əzgin və ya bayğın hala gəlmək. *Gorus dağının qaşında Nəbini isti vurur, bir kölgəlik tapıb uzanır.* "Qaçaq Nəbi". **İsti yer** – sakit, rahat, qazanclı, gəlirli iş, vəzifə, mənasında. *O gah getmək istədi, gah da isti yerini soyutmaqdan qorxdu.* Mir Cəlal. **İsti-soyuq dadmaq** (**görmək, bilmək** və s.) – b a x **bərkə-boşa düşmək** ("**bərk-boş**"da). [Məsum kişi:] *..Oxuyanda nə olar, – deyirdi, – uşağın birisidir. Dünyanın işlərini nə qanır. İsti-soyuq dadmayıb.* Mir Cəlal. *Durna bacı dünyanın isti-soyuğunu yaxşı bilən adamlardan idi.* Ə.Sadıq.

**İSTİARƏ** *is.* [*ər.*] *ədəb.* Sözlərin, ifadələrin hər hansı bir təşbeh, bənzəyiş, müqayisə əsasında məcazi mənada işlənməsindən, yəni bir şeyə (hadisəyə) başqa bir şeyin (hadisənin) səciyyəvi əlamətinin keçirilməsindən ibarət bədii tərz; metafora; məsələn, şücaətli adama – aslan, şir; hiyləgər adama – tülkü deyilməsi kimi. *Sadə istiarə. Mürəkkəb istiarə. Fikrin istiarə yolu ilə ifadəsi. – Yazıçıların sənətkarlıq xüsusiyyətlərindən asılı olaraq istiarə müxtəlif, rəngarəng şəkillərdə yaradılır.* Ə.Mirəhmədov.

**İSTİBDAD** *is.* [*ər.*] 1. Özbaşınalığa və zorakılığa əsaslanan idarə üsulu. *Çar zamanı idi, istibdadın ən şiddətli, ən qızğın vaxtı idi.* E.Sultanov. *Beşinci il; Qanlı bazar; İstibdadın mənhus əli; Hər tərəfdə iz buraxır.* R.Rza.

2. Zülm. *Artıq bu rəzalət çəkilməz; Bu istibdadə təhəmmül edilməz.* H.Cavid. *Yoldaşlar, istibdad pəncəsində inləyən yüz minlərcə işçilər baş qaldırmadadır.* Çəmənzəminli. *İstibdad dünyasından..; Odların, alovların üstündən addadıq biz.* S.Rüstəm.

**İSTİBDADÇI** *is.* Zalım, qəddar, qaniçən.

**İSTİCƏ** *sif.* 1. İsti, lazımınca isti. *İsticə otaq. İsticə paltar. – İsticə lavaşım var; Hər gecəyə aşım var; Demə, dədəm yerdəsən; Ancaq əlli yaşım var.* M.Ə.Sabir. *Var isticə*

*ölkələr; Qışda bizə xoş gələr.* A.Səhhət. *Qorodovoy qış günəşinin isticə şüası altında laqeydanə xoruldayırdı.* Çəmənzəminli.

2. *məc.* Rahat, əlverişli, mənfəətli. *Elm və maarif kəsb edənlərimizin ümdə arzusu özlərini şəhərə salıb, isticə və mənfəətli qulluq tapmaqdır.* F.Köçərli.

**İSTİFADƏ** *is.* [*ər.*] Faydalanma, fayda götürmə. // Faydalı (səmərəli) surətdə işlətmə. ◻ **İstifadə etmək** – faydalanmaq. *Vəqtdən daim istifadə edin; Elm təhsilini iradə edin.* M.Ə.Sabir. *Ağca xanım atasının belə mehriban rəftarından istifadə edərək .. divanın altına baxdı və Qaraca qızı orada görməyib mat qaldı.* S.S.Axundov. *Azadlığın nemətlərindən istifadə etməyi, bərabərliyin imtiyazlarından bəhrəyab olmağı bacarmaq lazımdır.* M.İbrahimov

**İSTİFADƏLƏNMƏ** "İstifadələnmək"dən *f.is.*

**İSTİFADƏLƏNMƏK** *f.* Faydalanmaq, fayda götürmək, qazanmaq, mənfəətbərdar olmaq.

**İSTİFADƏLİ** *sif.* İstifadə olunan (oluna bilən), istifadəyə yararlı. *İstifadəli yerlər.*

**İSTİFADƏLİK** *sif.* İstifadə etmək (işlətmək, tətbiq edilmək) üçün olan, istifadəyə (işlənilməyə, tətbiq edilməyə) yarar.

**İSTİFADƏSİZ** *sif.* və *zərf* İstifadə olunmayan, işləksiz qalmış, fayda götürülməyən. *İstifadəsiz torpaqlar. İstifadəsiz qalmaq.*

**İSTİĞFAR** *is.* [*ər.*] *din.* Allaha yalvararaq günahlarının bağışlanmasını istəmə, "əstəğfürullah" deyərək peşmanlığını bildirmə, tövbə etmə. ◻ **İstiğfar etmək (qılmaq)** – Allaha yalvararaq günahlarının bağışlanmasını istəmək, "əstəğfürullah" deyərək tövbə etmək. [Molla Zaman:] *İstiğfar elə, arvad, istiğfar elə, günaha batdın.* Ə.Haqverdiyev. *Bu minval ilə günahkar muzdur özünün bəd əməlindən peşman olub, istiğfar edə-edə yerindən qalxdı.* S.M.Qənizadə. *İstiğfar eylə, adam ağzına gələni danışmaz.* H.Nəzərli.

**İSTİHALƏ** *is.* [*ər.*] Bir haldan başqa hala keçmə.

**İSTİXARƏ** *is.* [*ər.*] *din.* Görüləcək bir işin uğurlu olub-olmayacağını qabaqcadan bilmək üçün Quran və ya təsbehlə yoxlama ayini. ◻ **İstixarə etmək (etdirmək)** – istixarə ayini icra etmək (etdirmək). [Məşədi İbad:] *Mən bu gün istixarə elətdirərəm, bu xoş günlərin birində toyumuzu başlarıq.* Ü.Hacıbəyov. *Fikr edirik biz də bir iş başlayaq; Eyləyirik istixarə, bəd gəlir.* Ə.Nəzmi. [Kiçik xan:] *Qoca, bir istixarə et! – dedi, – görək bu səfər uğurludur, ya uğursuz.* S.Rəhimov.

**İSTİ-İSTİ** *zərf* 1. Qaynar halda, isti halda, soyumamışkən. [Səlimnaz xanım:] *İsti-isti bu çayı iç, bəlkə tərləyəsən.* N.Vəzirov. [Ələmdar] .. *buğlana-buğlana, cızhacızla qovrulan cızbızdan isti-isti ötürdü.* S.Rəhimov.

2. *məc.* Təxirsiz, gecikmədən, dərhal, əl-üstü, o saat, təzə-təzə. *İsti-isti işin üstünə düşmək. Məsələni isti-isti həll etmək. – Dəmiri isti-isti döyərlər.* (Ata. sözü).

**İSTİQAMƏT** *is.* [*ər.*] 1. Bir şeyin hərəkət xətti, hərəkətin yönəldiyi cəhət, səmt, tərəf. *İnsanlar təbiəti istədikləri istiqamətdə dəyişdiriblər. Adamlar müxtəlif istiqamətlərə yollandılar. – Nəhayət, qadın birdən-birə istiqamətini dəyişib, üzüaşağı Dəclə sahilinə tərəf getməyə başladı.* M.S.Ordubadi. ◻ **İstiqamət almaq (götürmək)** – müəyyən bir tərəfə, səmtə doğru yönəlmək, üz tutub getmək. *Bir göz qırpımında düşmən tankı artıq ön atəş xəttini keçmiş, .. batalyon komanda məntəqəsi yerləşən təpəyə doğru istiqamət almışdı.* Ə.Məmmədxanlı.

2. *məc.* Hər hansı bir fəaliyyətin, işin, hadisənin və s.-nin inkişaf xətti. *Səyahətin istiqaməti. Elmin başlıca istiqaməti. – Respublikada neft axtarışının istiqaməti haqqında qızğın mübahisələr gedirdi.* M.Süleymanov.

3. İctimai, siyasi, elmi və s. cərəyan. ..*Səlimi tamamilə başqa bir istiqamətin adamı idi.* M.İbrahimov. ◻ **İstiqamət vermək (göstərmək)** – istiqamətləndirmək, yönəltmək, yol göstərmək. *Din düşüncəsi tarix boyu cəmiyyətin mənəvi inkişafına istiqamət veribdir.*

**İSTİQAMƏTLƏNDİRİCİ** b a x **istiqamətverici**. *İstiqamətləndirici məsləhətlər.*

**İSTİQAMƏTLƏNDİRİCİLİK** *is.* İstiqamət vermə, yönəltmə, yol göstərmə. ..*Burada*

*böyük bir qüvvənin təşkilatçılıq, istiqamətləndiricilik qüdrətinin hakimiyyəti duyulur.* Mir Cəlal.

**İSTİQAMƏTLƏNDİRİLMƏ** "İstiqamətləndirilmək"dən *f.is.*

**İSTİQAMƏTLƏNDİRİLMƏK** *məch.* İstiqamət verilmək, yönəldilmək.

**İSTİQAMƏTLƏNDİRMƏ** "İstiqamətləndirmək"dən *f.is.*

**İSTİQAMƏTLƏNDİRMƏK** *f.* 1. İstiqamət vermək, yönəltmək. *Müəllim şagirdin diqqətini əsas məsələyə istiqamətləndirməlidir.*

2. Yoluna qoymaq, qaydaya salmaq, təşkil etmək. *İşi düzgün istiqamətləndirməli.*

**İSTİQAMƏTLƏNMƏ** "İstiqamətlənmək"-dən *f.is.*

**İSTİQAMƏTLƏNMƏK** *f.* 1. İstiqamət almaq, yönəlmək; bir səmtə, bir tərəfə üz tutub getmək, yollanmaq. *Maşın şimala doğru istiqamətləndi.*

2. *məc.* Təşkil olunmaq, yoluna düşmək, düzəlmək, qaydaya düşmək.

**İSTİQAMƏTLİ** *sif.* 1. İstiqaməti olan, müəyyən istiqamətdə inkişaf edən (etdirilən).

2. *məc.* Qarşısına müəyyən məqsəd qoyaraq ardıcıl surətdə onun dalınca gedən; əzmli. *Ağahüseyn Xəlilin üzündən öpüb dedi: – Oğlum, sən ki belə istiqamətli oğlansan, Allah sənin başından tökəcək.* Ə.Haqverdiyev.

**İSTİQAMƏTSİZ** *sif.* İstiqaməti müəyyən olmayan, səmti, tərəfi təyin edilməmiş. [Qədir] *küçəyə çıxdı, istiqamətsiz* (z.) *yerişlə gəzindi.* Mir Cəlal.

**İSTİQAMƏTVERİCİ** *sif.* 1. İstiqamət verən, yönəldici. *İstiqamətverici qüvvə.*

2. *məc.* Yol göstərən, istiqamət verən, rəhbər, təşkilatçı. *Cəmiyyətin rəhbər və istiqamətverici qüvvəsi.*

**İSTİQANLI** *sif.* 1. Qanı isti olan. *İstiqanlı heyvanlar. Balina istiqanlı heyvandır.*

2. *məc.* Çox ünsiyyətli, adamayovuşan, mehriban, üzügülər. *İstiqanlı uşaq. İstiqanlı adam. – Əsasən çox istiqanlı olan bu gənc, komandirlə soyuqqanlı danışırdı.* Ə.Vəliyev.

**İSTİQANLILIQ** *is.* 1. Mehribanlıq, səmimilik, üzügülərlik. *Kərim bunu yaxşı bir dostluq istiqanlılığı kimi qiymətləndirirdi.* İ.Əfəndiyev.

2. Coşqunluq, dəliqanlılıq. *..Gələcək qohumluğu möhkəm əsaslar üstündə qurmaq üçün o, .. Səliminin tərzi-təfəkkürünü dəyişməli, cavanlıq və istiqanlılıqdan doğan bəzi hərəkətlərini təshih etməli idi.* M.İbrahimov.

**İSTİQBAL** *is.* [*ər.*] 1. Gələcək. *Oğlanlarının istiqbalı haqqında da Hacı Vəlinin müəyyən planları və prinsipləri var idi.* Çəmənzəminli. [Nümayəndə:] *Yaşasın Şərq qadını və onun parlaq istiqbalı!* Ə.Haqverdiyev.

2. Gələn adamın qarşısına çıxma; qarşılama. *Atabəy Məhəmməd qardaşları üçün böyük bir istiqbal təntənəsi düzəltdi.* M.S.Ordubadi. □ **İstiqbal etmək** – qabağına çıxmaq, qarşılamaq, gələni qəbul etmək. *Görcəyin bizləri o sahibi-mal; Çıxıban dişrə etdi istiqbal.* S.Ə.Şirvani. *Hacı Səlimin qaynı onu təziyə üçün gəlmiş qohumu qəbul edəntək istiqbal edib, bir neçə gün ehtiram ilə müsafir saxladı.* Ə.Haqverdiyev. *Əhməd .. qayıdanda .. necə istiqbal edəcəklərini də xəyalından keçirirdi.* B.Talıblı. **İstiqbala çıxmaq** – gələn adamın qabağına çıxmaq, qarşılamaq. *Livarcanın ağası Hacı xan iki oğlanları və nökərləri ilə bərabər bizim istiqbalımıza çıxmışdı.* M.S.Ordubadi.

3. *köhn.* Qrammatikada: gələcək zaman felinin adı.

**İSTİQBALÇI** *is.* və *sif.* Gələnin və ya gələnlərin qabağına çıxan, qarşılayan, istiqbal edən (adam). *Qadınların istiqbalçı qafiləsi təxti-rəvan və kəcavələrdə gedir və hər kəsin diqqətini özünə cəlb edirdi.* M.S.Ordubadi.

**İSTİQLAL** *is.* [*ər.*] Müstəqillik, istiqlaliyyət. *Bu qədər çətinlik və məhrumiyyətə baxmayaraq, Azərbaycan xalqının istiqlala olan ümidləri sönməmişdi.* M.S.Ordubadi. *Çox sevirik canımızdan; Ətimizdən, qanımızdan; Bizim böyük istiqlalı.* S.Vurğun.

**İSTİQLALİYYƏT** *is.* [*ər.*] 1. Siyasi müstəqillik; başqalarından asılı olmayıb, özbaşına yaşama; siyasi azadlıq. *Milli istiqlaliyyət. İstiqlaliyyət qazanmaq. Vətənin istiqlaliyyətini qorumaq.*

2. *məc.* Müstəqillik, azadlıq. *Kəndlilərindən başlayaraq ziyalılarına qədər bir söz deyir: – Azərbaycanın istiqlaliyyət məsələsi həyat məsələmizdir.* M.S.Ordubadi. *Rəşid*

*inanırdı ki, Süsən kimi mənəvi istiqlaliyyətini saxlayan insanlar ömürlərində yalnız bir dəfə, yalnız birini sevirlər.* M.Hüseyn.

**İSTİQLALİYYƏTPƏRVƏR** *sif.* [*ər.* istiqlaliyyət və *fars.* ...pərvər] Öz vətəninin, öz xalqının istiqlaliyyətini, siyasi azadlığını istəyən, sevən, onun uğrunda mübarizə edən.

**İSTİQLALİYYƏTPƏRVƏRLİK** *is.* Öz vətəninin istiqlaliyyətini, siyasi azadlığını istəmə, sevmə.

**İSTİQRAR** *is.* [*ər.*] *köhn.* 1. Qərar tutma, yerləşmə.

2. Sabitləşmə, aydınlaşma.

**İSTİQRAZ** *is.* [*ər.*] Borc alma, borc pul alma, borc alınan pul.

◊ **Dövlət istiqrazı** – borc əsasında olaraq əhalinin pul vəsaitinin dövlət büdcəsinə cəlb edilməsi forması. *Üçfaizli dövlət istiqrazı. İstiqraz vərəqəsi.*

**İSTİL[1]** *is. məh.* Çəltik əkininin suvarılmasında istifadə edilən su anbarı.

**İSTİL[2]** *is. məh. köhn.* 400 qramlıq çəki daşı. *Sən ora səpmişdin bir istil darı; Ümidliydin ondan bir tağar olsun.* Aşıq Ələsgər.

**İSTİLA** *is.* [*ər.*] 1. Bir ölkəni zorla alma, ələ keçirmə, tutma. *Qızıl Arslanın əcnəbi istilasına qarşı başladığı mübarizə yuxarıdakı fikrimizə tamamilə müvafiqdir.* M.S.Ordubadi. ☐ **İstila etmək** – bir ölkəni zorla ələ keçirmək, işğal etmək, tutmaq. *Ölkələr istila etmək.*

2. *məc.* Qaplama, tutma. ☐ **İstila etmək** – qaplamaq, tutmaq. *Ənisənin qaşları çatıldı, yanaqlarını bir qırmızılıq istila etdi.* S.Hüseyn.

**İSTİLAÇI** *is.* İstilaçılıq siyasəti yeridən, istila edən; qəsbkar, işğalçı. *Xarici istilaçılar.*

**İSTİLAÇILIQ** *is.* Özgə torpağını, başqa ölkələri zorla ələ keçirmə, tutma, qəsb etmə; işğalçılıq, qəsbkarlıq. *İstilaçılıq siyasəti.*

**İSTİLAH** *is.* [*ər.*] *köhn.* Termin. [Mirzə Rəhim ağa:] *Bala, mən fanatizmin mənasını bilmirəm. .. Bu sözlər firəngiməabların təzə istilahlarıdır.* M.S.Ordubadi. *Aydının fikrincə, şair adi və şablon sözdən qaçıb, təzə bir istilah yaratmışdı.* M.Hüseyn.

**İSTİLƏMƏ** "İstiləmək"dən *f.is.*

**İSTİLƏMƏK** b a x **istiləşdirmək**.

**İSTİLƏNDİRİLMƏ** "İstiləndirilmək"dən *f.is.*

**İSTİLƏNDİRİLMƏK** *məch.* İsti edilmək, qızdırılmaq, hərarəti artırılmaq, isidilmək.

**İSTİLƏNDİRMƏ** "İstiləndirmək"dən *f.is.*

**İSTİLƏNDİRMƏK** *f.* İsti etmək, qızdırmaq, isitmək, hərarətini artırmaq.

**İSTİLƏNMƏ** "İstilənmək"dən *f.is.*

**İSTİLƏNMƏK** *f.* Qızmaq, qızışmaq, isinmək. *Hava istilənib. Su gün altında istilənibdir.* // *qayıd.* Özünü, bədənini, canını qızdırmaq. *Ocağın qabağında istilənmək.* // İstidən bihal olmaq.

**İSTİLƏŞDİRİLMƏ** "İstiləşdirilmək"dən *f.is.*

**İSTİLƏŞDİRİLMƏK** *məch.* İstiliyi artırılmaq, daha da qızdırılmaq (isidilmək).

**İSTİLƏŞDİRMƏ** "İstiləşdirmək"dən *f.is.*

**İSTİLƏŞDİRMƏK** *f.* Daha isti hala salmaq, istiliyini artırmaq; qızdırmaq, isitmək. *Otağı istiləşdirmək. Suyu istiləşdirmək.*

**İSTİLƏŞMƏ** "İstiləşmək"dən *f.is.*

**İSTİLƏŞMƏK** *f.* İstiliyi artmaq, temperaturu artmağa başlamaq; daha da qızmaq, isti olmaq. *Yayın son ayı idi. Peterburqun havası istiləşmişdi.* Çəmənzəminli. *Gecələri yatmaq mümkün deyil, hava xeyli istiləşib, bu şoğərib taxtabitiləri də bir yandan!..* C.Məmmədquluzadə. *Havalar get-gedə istiləşdiyi üçün çayların suyu çox artmışdı.* S.Hüseyn.

**İSTİLƏTMƏ** "İstilətmək"dən *f.is.*

**İSTİLƏTMƏK** *icb.* İstiləndirmək (başqası vasitəsilə).

**İSTİLİK** *is.* 1. *fiz.* Cismin hissəciklərinin (atomlarının, molekullarının və s.-nin) qeyri-müntəzəm hərəkəti nəticəsində əmələ gəlib, onun qızması şəklində təzahür edən enerji növü. *İstilik vahidi. Ərimə istiliyi. Kimyəvi enerjinin istiliyə çevrilməsi.*

2. Bir şeyin qızğınlıq halı; isti, yaxud qızdırılmış şeydən çıxan hərarət. *Havanın istiliyi. Sobanın istiliyi. Günəş şüasının istiliyi.* – [Əbülhəsən bəy:] *Alnımda bir istilik hiss edər-etməz gözlərimi açdım..* M.S.Ordubadi. *..Toğluların yumşaq yunu və istiliyi sanki Qulunun əlini qıcıqlayırdı.* M.İbrahimov.

3. Qızdırma, hərarət, temperatur. *Xəstənin istiliyi normaldır.* – [Qəhrəman] *uşağın istiliyini ölçür, gözlərinə yuxu gəlmirdi..* S.Rəhimov. *Oğlunun istiliyini görən ana*

*gözlərinə dəm verir.* Ə.Vəliyev. □ **İstilik gəlmək (basmaq)** – hərarəti qalxmaq, bədəni qızmaq. *Soyuqdan əsən bədənə ani bir istilik gəldi.*

4. *məc.* Mehribanlıq, səmimiyyət hissi; hərarət. *Öz məsum təbəssümü ilə hamını sevindirən Aslan evdəki soyuqluğu tamamilə həyətə qovmuş, qocaların və anasının ürəyinə xoş bir istilik gətirmişdi.* Ə.Vəliyev.

**İSTİLİKKEÇİRƏN** *is. fiz.* İstilikkeçirmə qabiliyyətinə malik olan. *İstilikkeçirən cisimlər.*

**İSTİLİKKEÇİRMƏ** *is. fiz.* Cisimlərin istiliyi keçirmə xassəsi (qabiliyyəti).

**İSTİLİKTÖRƏDİCİ** *sif. fiz.* İstiliktörətmə qabiliyyətinə malik olan.

**İSTİLİKTÖRƏDİCİLİK** b a x **istiliktörətmə**.

**İSTİLİKTÖRƏTMƏ** *is. fiz.* İstilik yaratma, istilik vermə qabiliyyəti.

**İSTİMDAD** *is.* [*ər.*] *köhn.* İmdad göstərmə, yardıma (köməyə) çağırma. *Sönük vücudu saçar hər dəm atəşin fəryad; Fəqət nə çarə! Əsərsiz bütün bu istimdad.* H.Cavid. *O baxışlarda çırpınan ruhum; Dilənir gözlərindən istimdad.* A.Şaiq. *Onların iltimas və istimdadına kimsə cavab vermirdi.* M.İbrahimov.

**İSTİNAD** *is.* [*ər.*] Dayanma, əsaslanma, söykənmə. *İstinad nöqtəsi* (əsaslanacaq, söykənəcək, dayaq ola biləcək şey). □ **İstinad etmək** – 1) arxalanmaq, bir şeyi dayaq, kömək hesab etmək. *Hökumət ancaq xalqın arzu və iradəsinə istinad etməlidir.* M.S.Ordubadi; 2) öz müddəalarını, fikrini və s.-ni sübut etmək üçün məntiqi dəlil kimi əsas götürmək. *Qabaqcıl nəzəriyyəyə istinad etmək.*

**İSTİNADƏN** *zərf* [*ər.*] *rəs. köhn.* İstinad edərək, əsaslanaraq, arxalanaraq, dəlil tutaraq. *Mövcud qərarlara istinadən... Mənbəyə istinadən...*

**İSTİNADGAH** *is.* [*ər.* istinad və *fars.* ...gah] 1. Sığınacaq, daldalanacaq yer; pənahgah. // İstinad nöqtəsi. [Nəcəf] *düşmənin ən qabaq və ən son istinadgahında dayanmışdır.* Mir Cəlal.

2. *məc.* Arxa, kömək, dayaq, istinad ediləcək qüvvə. [Qəhrəman] *Azərbaycan kəndlilərinin dayağı, istinadgahı olan Bakıya gedirdi.* Ə.Vəliyev. *Səmədin yeganə ümidi, istinadgahı Sultan idi.* İ.Hüseynov.

**İSTİNTAQ** *is.* [*ər.*] *hüq.* Cinayətlə əlaqədar məsələni aydınlaşdırmaq üçün aparılan sorğu-sual; söylətmə, soruşma, dindirmə, ifadə alma (müttəhimdən, şahiddən). *Zeynal başını aşağı salmışdı. İlk istintaqda söylədiyi bir sözü dana bilməyəcəkdi.* S.Hüseyn. *İstintaq qurtardı, divan quruldu; Yeyən kim, tələyə düşən kim oldu.* B.Vahabzadə. *İstintaq xeyli uzandı.* S.Şamilov. □ **İstintaq etmək (eləmək)** – dindirmək, soruşmaq, ifadə almaq (müttəhimdən, şahiddən). *Qalındodaq, çalsaqqal bir rəis* [Əjdəri] *düz yarım saat istintaq elədi.* S.Rəhman. [Cahangir:] *..Mən Sadıqovun adamlarını istintaq edirdim.* İ.Əfəndiyev. **İstintaq olunmaq** – dindirilmək, soruşulmaq, ifadə alınmaq. *O, il yarıma qədər müxtəlif dustaqxanalarda istintaq olunmadan qalmışdır.* M.S.Ordubadi.

**İSTİNTAQÇI** *is. hüq.* İstintaq aparan ədliyyə işçisi; müstəntiq.

**İSTİOT** *is.* 1. *bot.* Tropik bitki və onun dadı kəskin yandırıcı dənələr şəklində olan meyvəsi. *Qara istiot. – İstiot cinsinin qara istiot növü. Cənub-Şərqi Asiyanın tropik ölkələrində və Malay adalarında bitən, sarmaşan bitkidir.* M.Qasımov.

2. Bibər. *Acı bibər. Bolqar bibəri.*

3. Həmin bitkilərin toxumlarından toz halında hazırlanan ədviyyə. *Xörəyə istiot vurmaq. Bozbaşın istiotu çoxdur. – Gülşən qazanın qapağını qaldıranda istiot və toyuq ətinin iyi budkanı bürüdü.* M.Süleymanov.

4. *məc.* Tündlük, acılıq, kəskinlik, hirs, qəzəb mənasında. *Amma mən deyirəm ki, belə millətpərəstliyin istiotu bir az çoxdur, az qalır adamın ağzını yandırsın.* C.Məmmədquluzadə. [Gödək kişi] *dik-dik Qədirin üzünə baxdı. İstiot kimi tünd cavab verdi.* Mir Cəlal.

◊ **İstiot dadmaq** – bərkə-boşa düşmək, həyatın acılıqlarını dadmaq, ağır günlər keçirmək. [Salman kişi:] *Siz xoşbəxt adamlarsınız, .. istiot dadmamısınız, .. hər şeyin hazırına gəlibsiniz.* Mir Cəlal.

**İSTİOTQABI** *is.* İçinə istiot tökülən qab.

**İSTİOTLAMA** "İstiotlamaq"dan *f.is.*

**İSTİOTLAMAQ** *f.* Üstünə istiot səpmək, istiot vurmaq. *Xörəyi istiotlamaq. Əti istiotlamaq.*

**İSTİOTLANMA** "İstiotlanmaq"dan *f.is.*

**İSTİOTLANMAQ** *məch.* Üstünə istiot səpilmək, istiot vurulmaq.

**İSTİOTLANMIŞ** *f.sif.* Üstünə istiot səpilmiş, istiot vurulmuş.

**İSTİOTLU** *sif.* Tərkibində istiot olan; istiot qatılmış. *İstiotlu xörək. İstiotlu halva.*

**İSTİOTLUQ** *is.* İstiot əkilmiş yer.

**İSTİÖLÇƏN** *is.* Termometr. *Üç yüz il bundan əvvəl ağıllı və elmli insanlar bir* [alət] *icad etdilər ki, bununla istilik də ölçmək mümkün oldu. Bu alətin adını "termometr", "mizanülhərarə", yəni "istiölçən" qoydular.* H.Zərdabi.

**İSTİRAHƏT** *is.* [*ər.*] Dincəlmə, rahatlanma; dinclik, rahatlıq. [Odunçu:] *Bu nə gündür, nə dirilikdir ki, heç bir istirahət yox.* Ü.Hacıbəyov. [Qulu:] *Hər gün saat birdən üçə qədər .. istirahət saatlarıdır.* İ.Əfəndiyev. *Bura* [pəncərə qabağı] *Sultanın bir növ istirahət yeri idi.* İ.Hüseynov. ☐ **İstirahət etmək (eləmək)** – dincəlmək, rahatlanmaq, yorğunluğunu almaq, dincini almaq. [Əhməd atasına:] *İndi sən əyləş burada, nə qədər kefindir istirahət elə.* Ə.Haqverdiyev. *İmtahandan sonra adam istirahət etmək istəyir.* H.Seyidbəyli. **İstirahət evi** – zəhmətkeşlərin istirahətinə xidmət edən səhiyyə müəssisəsi. *Bizim aramızda Şuşa istirahət evlərindən qayıdan işçiləri .. olduğu kimi, yeddi-səkkiz nəfər gənc tələbə .. vardı.* S.Hüseyn. [Dostum:] *Hələ bundan başqa, istirahət evlərində, sanatoriyalarda istirahət edənlər nə qədərdir..* M.Rzaquluzadə. **İstirahət günü** – işdən azad gün. *Mənim bu gün istirahət günüm olduğu üçün işləməyəcəyəm.* H.Nəzərli. [İnci:] *İstirahət günü arvadını gözüyaşlı qoyub buralarda hərlənməzsən.* S.Rəhman.

**İSTİRAHƏTCİL** *sif.* Daima istirahət etməyə, özünə baxmağa vərdiş edən, işləməyi sevməyən. *İstirahətcil adam.*

**İSTİRAHƏTGAH** *is.* [*ər.* istirahət və *fars.* ...gah] *tənt.* Dincəlinən, rahatlanan, istirahət edilən yer. [Cəmil bəy:] *Mənim təbibim əcəl, istirahətgahım da məzarıstandır.* H.Cavid.
◊ **Əbədi istirahətgah** *tənt.* – qəbir. *Minlər, on minlərlə insanların əbədi istirahətgahları olan bu möhtərəm, müqəddəs məkan tamamilə dağılmış, onun yerində bağ, park salınmışdı.* S.Hüseyn.

**İSTİRAHƏTXANA** *is.* [*ər.* istirahət və *fars.* xanə] b a x **istirahətgah**.

**İSTİRAHƏTQABAĞI** *zərf* İstirahətdən qabaq, əvvəl.

**İSTİRAHƏTLƏNMƏ** "İstirahətlənmək"dən *f.is.*

**İSTİRAHƏTLƏNMƏK** *f.* Dincəlmək, rahatlanmaq, istirahət etmək, yorğunluğunu (dincini) almaq. *Hər dəfə öküzləri açıb çəmənə buraxırdıq, onlar da bir az dincəlir və kövşək çalırdı. Biz də istirahətlənirdik.* T.Ş.Simurq.

**İSTİRAHƏTLİ** *sif.* Rahat, iztirabsız. ..*Hər kəsə istirahətli bir həyat təmin eləmək ən böyük məfkurə hesab edilir.* Çəmənzəminli.

**İSTİRAHƏTLİK** *is. dan.* İstirahət, rahatlıq, dinclik. *Heç bir istirahətliyi yoxdur.*

**İSTİRAHƏTSİZLİK** *is.* Narahatlıq, rahatsızlıq; istirahət etməmə. [Xosrovbəylinin dayısı] *öz səfərindən, dəmir yolundakı istirahətsizliklərdən şirin-şirin danışırdı.* Mir Cəlal.

**İSTİRHAM** *is.* [*ər.*] Yalvarma, mərhəmət istəmə, rica etmə.

**İSTİSQA** *is.* [*ər.*] *tib.* Bədənin müxtəlif boşluqlarına su toplanma xəstəliyi. [İkinci ərizəçi:] *Xan, başına dönüm, bunun qardaşı mühlik istisqa mərəzinə mübtəla idi.* M.F.Axundzadə.

**İSTİSMAR** *is.* [*ər.*] 1. Hər hansı bir əməli məqsəd üçün sistematik istifadə etmə, faydalanma, işlətmə. *Neft quyularının istismarı. Təbii sərvətlərin istismarı. – Lakin Nobelin bütün o inadlı səylərinə baxmayaraq, Şibayev də adaya pəncəsini ilişdirdi, o da tələsik bir-iki quyu qazdırıb istismara başladı.* Ə.Məmmədxanlı. ☐ **İstismar etmək** – işlətmək, istifadə etmək, faydalanmaq. **İstismara verilmək** – işlənməyə (istifadəyə) başlanmaq. *Mexanikləşdirilmiş üsulla ilk neft quyusu Azərbaycanda 1871-ci ildə .. qazılıb istismara verilmişdir.* S.Quliyev. *Sabah sex istismara verilməli idi.* H.Seyidbəyli.

2. İstehsal vasitələri üzərində xüsusi mülkiyyət sayəsində insanların bir qisminin başqalarının əmək məhsulunu mənimsəməsi. *İstismarın son dərəcəyə çatdığını, zəhmət şəraitinin qabalığını, fəhlənin rütubətli zirzəmilərdəki fəryadını bizdən başqa da hiss edənlər vardır.* M.S.Ordubadi. *Hər kəs zəhmət və istismarın nə olduğunu indicə anlamağa başlayır.* H.Nəzərli. ◻ **İstismar etmək** – başqasının zəhmətini, məhsulunu mənimsəmək, amansızcasına özü üçün işlətmək. **İstismar olunmaq** – zəhmətinin məhsulu amansızcasına mənimsənmək. *Fəhlələr amansız surətdə istismar olunurdu..* H.Nəzərli.

**İSTİSMARÇI** *is.* 1. Başqasının zəhmətini, məhsulunu mənimsəyən, özgəsini istismar edən. // Sif. mənasında. *İstismarçı siniflər. İstismarçı cəmiyyət. – "Əkinçi" istismarçı və tüfeyli təbəqələri kəskin tənqid etməkdən çəkinmirdi.* M.İbrahimov.

2. *xüs.* Neft quyuları qazılıb qurtardıqdan, yaxud başqa sənaye müəssisələri tikilib qurtardıqdan sonra onları istismar üçün hazır hala salan fəhlə. *İstismarçı briqada.*

**İSTİSMARÇILIQ** *is.* Başqasını insafsızca işlədərək, zəhmətinin məhsulunu mənimsəmə; istismar etmə.

**İSTİSNA** *is.* [*ər.*] Ümumi qaydadan çıxarma, ayırma. *İstisna təşkil etmə. İstisna olmaq şərti ilə.* ◻ **İstisna etmək** – ümumi qaydadan kənarda buraxmaq, xaric etmək; çıxmaq. **İstisna etməmək** – ümumi qaydadan kənarda buraxmamaq, ümumi qaydadan xaric etməmək (çıxmamaq).

**İSTİSNALIQ** *is.* Ümumi qaydadan kənarda olma, istisna təşkil etmə.

**İSTİSNASIZ** *sif.* İstisna etmədən, heç birini ümumi tərkibdən ayırmadan, heç birini kənarda buraxmadan (çıxmadan), bütünlükdə. *İstisnasız olaraq hamı yığıncağa gəlməlidir.*

**İSTİ-SOYUQ** *is.* 1. İsti və soyuq hava və onun təsiri. *Özünü isti-soyuqdan qorumaq.* – [Səlim bəy:] *İsti-soyuqçün deyil başındakı bu papaq.* S.Rüstəm. [Səlbi:] *Oruc, papağı başa isti-soyuqçün qoymurlar, namus üçün qoyurlar.* Ə.Vəliyev.

2. *məc.* Hər cür şərait, vəziyyət, hal, keyfiyyət. *İsti-soyuq görmək. İsti-soyuqda olmaq. – O, .. hamı ilə qaynayıb-qarışan, isti-soyuqdan qorxmayan, möhkəm, dözümlü bir oğlan idi.* M.Rzaquluzadə.

**İSTİSU** *is.* 1. Xalq arasında isti müalicə suları çıxan yerə verilən ad. *Yayda İstisuya getmişdik.* – [Hacı Mehdi:] *Amma, gərək, övrət İstisudan gələnədək iş tamam ola.* Ə.Haqverdiyev.

2. Azərbaycanda çıxan müalicə sularından birinin adı.

**İSTİTÖRƏTMƏ** b a x **istiliktörətmə**. *İstitörətmə qabiliyyəti.*

**İSTİVURMA** *is. tib.* Çox isti havada günəşin təsirindən beyin mərkəzlərinin zədələnməsi; günvurma.

**İSTORİOQRÁFİYA** [*yun.* istoria və grapho] 1. Tarix haqqındakı biliklərin inkişafını öyrənən elm, tarixşünaslıq.

2. Hər hansı bir dövrdə meydana gəlmiş, yaxud bu və ya digər dövrə və ya problemə həsr olunmuş tarixi əsərlərin məcmusu; tarixi mənbələr, tarixi biblioqrafiya. *Sovet dövrünün istorioqrafiyası.*

**İSVEÇ(Lİ)** *sif.* və *is.* İsveç əhalisindən olan.

**İSVEÇRƏLİ** *sif.* və *is.* İsveçrə əhalisindən olan.

**İŞ** *is.* 1. Fəaliyyət, çalışma, zəhmət, əmək. *Əqli iş. Fiziki iş. İş görmək. Elmi iş. İşlə məşğul olmaq. – İş insanın cövhəridir.* (Ata. sözü). *İş rəncbərin, güc öküzün, yer özününkü; Bəyzadələri, xanları neylərdin, ilahi!* M.Ə.Sabir. *İş nə qədər qızğın və həvəslə getsə də, nəhayət, ev adamı çəkir.* M.İbrahimov. // Məşğuliyyət, məşğələ, bir şeylə baş qarışma. *Bu saat işim var, gələ bilmərəm. Faydalı bir işlə məşğul olmaq.* // İdarədə, müəssisədə və s.-də işləmək üçün təyin edilmiş vaxt, müddət. *İşdən sonra gələrsən. İşdən sonra istirahət. İş qurtardı.*

2. Bir şey yaratmaq, hazırlamaq, düzəltmək üçün göstərilən hər cür fəaliyyət, istehsal fəaliyyəti (bu mənada çox vaxt cəm halında işlənir). *Suvarma işləri. Yol işləri. Tikinti işləri. – Bakıda nəqliyyat işləri yarıtmaz idi.* A.Şaiq. [Göyçək] *yayın isti günlərində Tapdığı kürəyinə şələləyib, çöl və ev işlərini görür, onu yerə qoymurdu.* Ə.Vəliyev.

3. Bir idarə və ya müəssisədə çalışma, xidmət etmə, qulluq etmə; xidmət, vəzifə,

qulluq. *İşə girmək. İşdən çıxarmaq. Müəllimlik işi. Həkimlik işi. – Hərgah məni bir yerə işə qoymaq istəsəniz, hər barədə xatircəmlik verə bilərsiniz.* M.S.Ordubadi. *Göyçək həyatin ortasında Tapdığı şirin gəzdirdiyi vaxt Qaçay işdən gəldi.* Ə.Vəliyev. *Tahir gəlib .. çatdıqda, ikinci* [növbə] *çoxdan işə girmişdi.* S.Rəhman.

4. Bir şeyin hərəkət halında olması, enerjinin bir haldan başqa hala keçməsi prosesi; fəaliyyət. *Maşının fasiləsiz işi.*

5. Vəzifə, borc. *Vətəni müdafiə etmək bütün vətəndaşların işidir. Sülhü müdafiə etmək bütün dünya xalqlarının işidir.*

6. Hər hansı bir hadisə, faktla əlaqədar olan inzibati, məhkəmə təhqiqatı; mühakimə prosesi. *Məhkəmədə işə baxmaq. İşə yenidən baxılacaq. Cinayət işi.* – [Səfər bəy:] *..İki gündən sonra Cabbarın işinə baxacaqlar, əgər məhkəmədə biz işi uduzsaq, sən də zərərdidə olarsan.* B.Talıblı. // Cəza və ya təsir tədbiri olaraq icbari əmək, məhkəmə cəzası. ☐ **İş kəsmək (vermək), iş kəsilmək (verilmək)** – məhkəmə tərəfindən cəza vermək (verilmək). *İslam bu barədə çox düşündü. Əgər Telli ilə müəllimi bir yerdə öldürsə, güllələnməsə belə, ona on il iş verəcəklərdi.* S.Hüseyn. *Kim deyərdi ki, lüt bir rəncbərə iş kəsməkdə qəza məhkəməsi bu qədər götür-qoy eləməli olacaq?* Mir Cəlal.

7. Bir şəxsə, hadisəyə, məsələyə və s.-yə aid olan sənədlər toplusu. *İş qovluğu. Katib işləri açıb baxdı.* – [Gəldiyev] *qantər içində Vahidin işini tapmağa cidd-cəhd elədi.* Mir Cəlal.

8. Adətən cəm şəklində: xidmət, idarə, müəssisə ilə bağlı olan məsələlər, məşğələlər və s. *Cari işləri müzakirə etmək. İşləri təhvil vermək. Xidməti işlər.* // Bir sıra mürəkkəb idarə adlarının tərkibində işlənir. *Xarici İşlər Nazirliyi.*

9. Əsər, əmək məhsulu. *Elmi iş yazmaq. Bu kitab şairin son işi oldu. Muzeyin otaqlarının birində rəssamın işləri nümayiş edilirdi.*

10. Keyfiyyət, yaxud hazırlanma üsulu, qaydası. *Gör, nə qəşəng işdir! Qaba iş. Əla iş. Sifarişlə görülən iş. Atüstü iş.*

11. Əməl, hərəkət. *Bu onun işidir. Bu, yaxşı iş deyil.* – [Qulu:] *Xülasə, nə deyim, bu zamanın cahıllarının işini anlamaq çətindir.* N.Nərimanov. [Molla Bacı:] *Gündə ərə gedirəm, yaxşı edirəm, bidət iş görmürəm ki...* Çəmənzəminli. *Çoban baba təəssüflə dedi: – Ay Rüstəm, mən səni ağıllı bir adam bilirdim, bu nə işdir tutmusan?* M.İbrahimov.

12. Əməli fəaliyyət, feil, hərəkət (*fikir, söz* müqabili). *İndi söz yox, iş lazımdır. Sözdən işə keçmək. Söhbət çoxdur, iş isə az.*

13. Fəaliyyətin nəticəsi, səmərəsi. *Bu, uzun əsrlərin işidir.*

14. Münasibət, əlaqə, aidiyyət, dəxli olma. *Onun bizimlə nə işi var?*

15. Hadisə, əhvalat, qəziyyə. *Bu, keçmişin işidir. Mən dünən maraqlı bir işin şahidi oldum. Başıma dünən bir iş gəlib. – Ürəyimə dammışdı ki, Dəmirçioğlunun başında bir iş var.* “Koroğlu”.

16. Vəziyyət, hal. *İşi fəna olmaq. Cəbhədə iş yaxşıdır.* – [Məşədi İbad:] *İndi gördünüzmü iş nə haldadır?* Ü.Hacıbəyov.

17. Bacarıq, gücü çatma, bacarma, əlindən gəlmə. *Bu onun işi deyil* (əlindən gəlməz).

18. Şey, hadisə. *Bu böyüklükdə daşı qaldırmaq asan iş deyil. Təbii işdir ki... Tərslik pis işdir. Aydın işdir. Belə də iş olar?*

19. *fiz.* Hərəkət edən cismin müqavimətini rəf etməsi. *İş vahidi.*

20. **İşdi(r)** şəklində – bəlkə, birdən, əgər, təsadüfən, ola bilsin, ola bilər. *İşdir, yolun düşsə, bizə gəl. İşdir, öyrənsən, bizə də bildir. İşdi, birdən gəlməsə... – Molla fikirləşir ki, bir eşşək yükü xiyar götürüb Teymurləngə aparsın, bəlkə, işdi, rəhmə gəldi, bir yaxşı hədiyyə verdi.* “M.N.lətif.”. *İşdir, ayrı düşsək bir-birimizdən; Yığılın hamınız səhər lap tezdən.* H.K.Sanılı.

◊ **İş açmaq** – 1) başlamaq, bir işə təşəbbüs etmək, bir iş görmək niyyətində olmaq. *İstəyirik bir iş açaq, filməsəl; Söyləşirik biriki il laəqəl.* M.Ə.Sabir; 2) zəhmətə salmaq, xoşagəlməz işə salmaq. *Dayanan yerdə iş açdın! – ..İkram atasının baxışından anlamışdı ki, valideyn üçün əməlli-başlı iş açmış, onların ağrıyan başına dəsmal bağlamışdı.* Ə.Əbülhəsən. **İş adamı** – vaxtını boş keçirməyən, daim fəaliyyətdə olan, işbacaran, işləməyi sevən adam haqqında. **İş (işi, işimiz, işləri) Allaha qalıb** – çətin, ağır, çı-

xılmaz vəziyyət haqqında. *Axır ki işlərimiz lap Allaha qalıb.* C.Cabbarlı. **İş aparmaq** – iş görmək, işləmək, çalışmaq, fəaliyyət göstərmək. *İş apar, baş gedərsə, qoy getsin; Ad qalır, bəs deyilmi, millət ilə?* M.Ə.Sabir. *..Bu gunə iş aparmaq olmaz.* Ü.Hacıbəyov. **İş aşırmaq** – düzəltmək, yoluna qoymaq, başa çatdırmaq, öhdəsindən gəlmək. *Pəs elədə, yəqin, qlava bu işin üstünə düşüb, hər yolnan olmuş olsa, bu işi aşıracaq.* C.Məmmədquluzadə. **İş(i) aşmaq** – iş(i) yerinə yetmək, düzəlmək, həyata keçmək, baş tutmaq, başa gəlmək. [Məhərrəm:] *Canım, güc ilə iş aşmaz. Bir toyuğu güc ilə tutmaq olmaz.* C.Cabbarlı. **İş başına keçmək** – rəhbər vəzifə tutmaq, rəhbər işə keçmək. **İş başında** – vəzifə başında, vəzifəni yerinə yetirərkən. *Bir səs deyir: – Ey yaramaz! İş başında yatmaq olmaz!* R.Rza. **İş başında olmaq** – rəhbərlik etmək, idarə etmək, başçı olmaq, rəhbər vəzifə tutmaq. [Növrəstə:] *İndi qadınlar da iş başındadır.* Ə.Haqverdiyev. **İş burasında(dır) ki...** – bir şeyin səbəbini, mahiyyətini bildirir. [Molla Xəlil:] *İş burasında idi ki, qalibiyyətinə xatircəm deyildi.* S.Hüseyn. *Ancaq iş burasında idi ki, Cuma o arvaddan qorxurdu.* Ə.Əbülhəsən. **İş çıxmaq** – 1) gözlənilməyən bir iş ortaya çıxmaq, bir hadisə üz vermək. *Durduğum yerdə bir iş çıxdı;* 2) səmərəsi olmaq, faydası olmaq, kar çıxmaq. *Nə qılıncdan kar aşmadı, nə nizədən iş çıxmadı, nə əmuddan murad hasil olmadı.* "Koroğlu". **İş düşmək** – 1) bir hadisə üz vermək, bir iş çıxmaq. [Pəri xanım:] *Ay Sona! Neçə vaxtdır ha yığışıram, bircə səni görməyə gəlim, amma görürsən iş düşür.* Ə.Haqverdiyev; 2) fürsət düşmək. [Mərcan bəy:] *Nəzir eyləmişəm, iş düşsə, arvadı boşayam, çünki başqa əlacı yoxdur, boşamasam, çatlaram.* Ü.Hacıbəyov. **İş düzəlmək** – istənilən, arzu edilən bir şeyin yerinə yetməsi, həyata keçməsi, düzəlməsi, baş tutması haqqında. [Murad:] *Yusif! Muştuluğumu ver, iş düzəlibdir.* N.Nərimanov. [Əsgər:] *Aha, xalamın da işi düzəldi! Əcəb!* Ü.Hacıbəyov. **İş düzəltmək** – adamlara xeyirxahlıq göstərmək, bir işin düzəlməsinə, baş tutmasına kömək etmək, vasitə olmaq. [Məşədi İbad:] *Çox sağ olun, çox razıyam mən; Zəhmət çəkib iş düzəltdiniz.* Ü.Hacıbəyov. **İş görmək** – 1) işləmək, müəyyən bir işlə məşğul olmaq, bir şey üzərində çalışmaq, zəhmətlə məşğul olmaq. [Qoca:] *Yox, qızım, bu gün heç bir iş görməmişəm.* Ə.Məmmədxanlı; 2) hərəkət etmək. [Məhəmmədağa:] *Biz gərək həmə vaxt* [qanun] *ilə .. iş görək.* N.Nərimanov. **İş günü** – idarədə, müəssisədə və s.-də işləmək üçün müəyyən edilmiş vaxt, müddət. *Yeddisaatlıq iş günü.* **İş içində iş var** – şübhəli, müəmmalı iş, hadisə və s. haqqında. *Deyəsən, iş içində iş var.* – [Salamov:] *Əgər həqiqətdə onun Nikolayla davası var, bəs bura nə üçün gəlib, Fitilbörkə getsin də, bəs görünür ki, iş içində iş var.* C.Cabbarlı. **İş işdən keçmək** – artıq olub bitmiş, buna görə də düzəlməsinə, islahına vaxt, imkan olmayan iş haqqında. [Pərzad:] *Sən qurtaranadək iş işdən keçər.* M.F.Axundzadə. *Professor Süleyman bəy qəti cavab verdi ki, daha iş işdən keçib.* C.Məmmədquluzadə. [Pərzad:] *Əbəs yerə, Yusif bəy, arvad sözünə inanma, başına çarə qıl ki, iş işdən keçibdir.* N.Nərimanov. **İş işləmək** – iş görmək (ziyan, zərər vurmaq mənasında). *Ay çıxdı, düzə düşdü; Qıvrım tel üzə düşdü; Fələk bir iş işlədi; Ayrılıq bizə düşdü.* (Bayatı). **İş keçməmək, işi keçməmək** – başqasının köməyi olmadan düzəlməmək, başa gəlməmək, görülə (görə) bilməmək. *O olmasa iş keçməz. – ..Axırda bildim ki, müsəlman yazıçısı avama xoş gələn sözü yazmasa, işi keçməz.* C.Məmmədquluzadə. [Nurcahan:] *Sizə məlumdu, bizim şəhərdə nə qədər qız gedir, mənsiz iş keçmir.* N.Vəzirov. **İş qüvvəsi** *iqt.* – bir şeyin yaradılmasına, istehsal edilməsinə yönəldilən əmək, qüvvə. **İş sahibi** – özü üçün başqasına iş gördürən adam. *Bənna, fəhlənin xörəyini də iş sahibi verərdi.* Mir Cəlal. **İş tutmaq** – iş görmək, bir işlə məşğul olmaq, işləmək. [Şərəfnisə xanım:] *İtil cəhənnəmə deyirəm, əlimdə işim var, qoy işimi tutum!* M.F.Axundzadə. [Cəlil] *anasına iş tutmağa daha çox mane olduğu üçün anası Zəhra onu .. aparıb, məscid məktəbinə qoydu.* İ.Musabəyov. [Ballı:] *Hər halda yaxşı iş tutmamısan, bala!* İ.Əfəndiyev. **İş üstə qoymaq** – öyrətmək, təhrik et-

mək. **İş üstündə** – iş görən zaman, iş vaxtı, işlərkən, işdə. *Öküz qıyar canını; Bilməz qamçı sayını; Qayış çəkən qaşqa kəl; İş üstündə tanını.* (Bayatı). **İş var** – gizli, müəmmalı, şübhəli, üstüörtülü məsələ, şey haqqında. [Səlim:] *İsmət, inan, qaldım şübhə içində; Cavab ver, sonra get, bir iş var səndə.* H.Cavid. *Əkbər dərhal anlardı ki, iş var.* Mir Cəlal. **İş vurmaq** – pislik etmək, ayağından çəkmək. **İşçi qüvvəsi** – fəhlə. **İşdən (işindən) qoymaq** – işinə mane olmaq, işləməyə qoymamaq, işdən ayırmaq. *Gəldim, səni işdən qoydum. – Həm ürəyim yanır, həm də sən məni işimdən qoyursan.* "M.N.lətif.". **...işdən çıxıb** – fırıldaqçı, kələkbaz, çox macəralar keçirmiş adam haqqında. *O, min işdən çıxıb.* **İşdən düşmək** – köhnəlmək, dağılmaq, xarab olmaq, daha heç bir şeyə yaramamaq. *..Getmək istəyirdi, lakin ayaqqabıları tamamilə işdən düşmüşdü.* M.S.Ordubadi. [Hücrə] *evlərdə işlənib, işdən düşmüş köhnə həsirlər ilə döşənər, həsirlərin altı tozla dolu olardı.* H.Sarabski. *Əsgər işdən düşmüş çəkmələrini göstərdi.* Mir Cəlal. **İşə (bir işə) yapışmaq** – özünə bir məşğuliyyət tapmaq, bir işlə, bir sənətlə məşğul olmaq. **İşə can verməmək** – tənbəllik etmək, ürəkdən işləməmək, işə can yandırmamaq. **İşə can yandırmaq** – ürəkdən işləmək, qabiliyyətini, bacarığını iş üçün əsirgəməmək. *Müdirin otağındakı səliqəsizlik, narazı rəftar və danışığı işə can yandırmadığını göstərirdi.* M.İbrahimov. **İşə düşmək** – 1) hərəkət etmək, işləməyə başlamaq. *Mühərrik işə düşdü. Dəzgah işə düşdü. Stansiya işə düşdü;* 2) işə salınmaq. *Çox deyib az eşitdikdən sonra, çubuqla falaqqa işə düşərdi.* H.Sarabski. *Arşın, girvənkə, tərəzi yenə möhkəm işə düşmüşdü.* S.Vurğun; 3) xataya düşmək, çətinliyə düşmək, dolaşmaq, pis nəticələnə biləcək hadisəyə rast gəlmək. [Telli:] *Bəy, əcəb işə düşdüm!* Ü.Hacıbəyov. [Aslan bəy:] *Siz öləsiz, işə düşmüşəm, bu qotur nalbənd güclən deyir: – Gərək səni soyam.* N.Vəzirov. *Əcəbcə işə düşdük, – deyib güldüm özümə..* S.Rüstəm. **İşə girişmək (girmək, qapılmaq)** – həvəslə işə başlamaq, ciddi işləməyə başlamaq. *El-oba Nəbini öz gözünün didəsi kimi qoruyub saxlasa da, .. şeytan-şuğul bu qızıl vədindən ötrü işə girişirdi.* S.Rəhimov. *Bu sözlərdən sonra dostlar işə girişdilər.* M.Rzaquluzadə. **İşə qarışmaq** – müdaxilə etmək, işin gedişinə təsir etmək. *Qoca keşikçinin işə qarışmağına ehtiyac qalmadı.* M.Hüseyn. *Bəndalının ən böyük təsəllisi Tahirzadənin bu işə qarışması – şahid durması idi.* Mir Cəlal. **İşə pər qatmaq** – bir işin qaydası ilə getməsinə mane olmaq, düzəlmək üzrə olan bir işi cürbəcür yollarla pozmaq, düzəlməyə qoymamaq. **İşə salmaq** – 1) hərəkətə gətirmək, işlətməyə başlamaq, işlətmək. *Nəbi cəld özünə bir səngər tapıb daldalanandan sonra, aynalı tüfəngi işə salır.* "Qaçaq Nəbi". *Şofer maşını işə salanda motorun gurultusu top gülləsi kimi Rüstəmin başında partladı.* M.İbrahimov; 2) dolaşdırmaq, xataya düşməsinə səbəb olmaq. [Mahmud bəy:] *..Kərbəlayı Qulam xəbər verib, o xəbərə görə sizi işə salıblar..* N.Vəzirov. [Güllü:] *Bax, amandı, Mirzə, məni işə salarsan.* Ə.Haqverdiyev. **İşə soyuq baxmaq** – işə laqeyd münasibət bəsləmək, məsuliyyətsiz yanaşmaq, səhlənkarlıq etmək. **İşə tul vermək** – işi uzatmaq, ləngitmək. [Niyaz bəy:] *Yusif, necə ki mən eşitmişəm, işə tul verməyinizdən narazıdır.* N.Nərimanov. **İşə yapışmaq** – b a x **işə girişmək**. *Çimnaz arvad evi yır-yığış etməklə, işə yapışmaqla birtəhər başını qarışdırmaq .. istəyirdi.* Ə.Əbülhəsən. **İşə yaramaq (keçmək)** – bir şeyə gərək olmaq, lazım olmaq, istifadə edilə bilmək; faydası olmaq, xeyri olmaq; kara gəlmək. *Alınan şeylər işə yaradı.* – [Usta Məhəmməd:] *..Elə onun gülləsindən qolum şikəst oldu, indi də işə yaramır.* Çəmənzəminli. *..Son zamanlar tələbəlik çox da işə keçmədiyi üçün Kərim yekə ilmək papağı dəyişib, ikiüzlü bir papaq qoymuş*(*du*).. C.Cabbarlı. [Fəridə:] *Bizim seçdiyimiz gözəllər işə yaramır.* Ə.Məmmədxanlı. **İşi axsamaq** – geri qalmaq, çatdıra bilməmək, işi yaxşı getməmək. *İşimiz hələ də axsayır.* **İşi avand olmaq** – işi uğurlu olmaq, işi baş tutmaq, arzusuna, məqsədinə çatmaq, işi müvəffəqiyyətli olmaq. [Yusif:] *Sən də mənə təref cadu edərsən ki, mənim işim avand olsun.*

N.Nərimanov. **İşi başından aşmaq** – həddindən artıq işi olmaq, bərk məşğul olmaq. **İşi bitmək** – müvəffəqiyyətsizliyə uğramaq, iflas etmək, uğursuzluqla qurtarmaq, düzəlməsinə heç bir ümid yeri qalmamaq. **İşi dəymək** – işə mane olmaq, əngəl törətmək. **İşi düşmək** – hər hansı bir münasibətlə müraciət etməli olmaq, birindən bir şey xahiş etmək, birinin köməyinə ehtiyacı olmaq. *Adamın adama işi düşər. – Gün olmaz ki, onun mənə işi düşməsin.* C.Məmmədquluzadə. *Bir işim, ay qonşu, düşübdür sənə; Sən tanrı, qandır səbəbin bir mənə.* A.Səhhət. **İşi düyünə düşmək** – çətinlik qarşısında qalmaq, dolaşıb qalmaq, çıxış yolu tapa bilməmək. *Beləliklə də, Nənəqızın işi düyünə düşmüşdü.* S.Rəhimov. **İşi düz gətirmək** – işi istədiyi kimi getmək, müvəffəqiyyət qazanmaq. **İşi düz gətirməmək** – işində müvəffəqiyyətsizliyə, çətinliklərə rast gəlmək, işi istədiyi kimi getməmək. *Bu gün səhərdən Rüstəm kişinin işi düz gətirmirdi..* M.İbrahimov. **İşi düz olmaq** – heç bir əngəl, maneçilik olmamaq, hər bir şey istənilən qaydada olmaq. [Əsgər:] *Allaha şükür, mal-dövlət hamısı var, .. bununla adamın işi düz olmur, ürəyi toxtamır.* Ü.Hacıbəyov. **İşi gətirmək** – xeyir görmək, qazanmaq, fayda görmək, bəxti gətirmək, işi uğurlu olmaq. *Rüstəmin işi gətirəndə həmişə köklənmiş tar kimi səslənirdi.* M.İbrahimov. **İşi qatışmaq (pırtlaşmaq)** – b a x **işi düyünə düşmək**. **İşi müşkülə düşmək** – b a x **işi düyünə düşmək**. *Vay, vay, nə yaman müşkülə düşdü işim, Allah; Fəryadıma yet kim, yanıram atəşə, billah!* M.Ə.Sabir. **İşi olmamaq** – 1) dəyməmək, toxunmamaq, qarışmamaq, heç bir münasibət göstərməmək. *Uşaqda işin olmasın. Onda işin olmasın;* 2) əlaqəsi olmamaq, xoşu gəlməmək, xoşlamamaq, sevməmək. [Sultan bəy:] *Yoxsa bu incinar-mincinar, doxtur-moxtur, vəkil-məkil ilə mənim işim olmaz.* Ü.Hacıbəyov. *Cabbarın şit hərəkətlərlə, ədabazlıqla işi olmazdı.* İ.Əfəndiyev. **İşi sahmanlamaq** – yerbəyer etmək, qaydaya salmaq, düzəltmək. *Hey, yazıq arvad işi sahmanlayır; Gah Fatını, gah Sadığı yanlayır.* M.Ə.Sabir. **İşi şuluq (fırıq) olmaq** – 1) işinin üstü açıldığı üçün təhlükə, ağır məsuliyyət, cəza gözləmək. *..İndi mənim işim şuluqdur, ya dar ağacından asarlar, ya güllələyərlər.* M.Hüseyn; 2) ümumiyyətlə, ağır vəziyyətdə olmaq, həyatı təhlükə qarşısında olmaq. **İşi tutmaq** – b a x **işi gətirmək**. *Sizə rast gəldiyim üçün işim tutmadı.* “M.N.lətif.” *Üç-dörd ilin ərzində Rəhimin işi tutub, yaxşı qazanmışdı.* S.S.Axundov. **İşi yaş olmaq** – vəziyyəti pis olmaq, uğursuzluğa, müvəffəqiyyətsizliyə uğramaq; qorxulu vəziyyət içərisində olmaq. *İşləri yaşdı, qoymayın! Lap danabaşdı, qoymayın! Qırıldı, qaçdı, qoymayın!* M.Ə.Sabir. *Molla! İşim yaşdı, yazım, yazmayım? Huşü başım çaşdı, yazım, yazmayım?* Ə.Nəzmi. **İşi yeritmək** – məqsədə çatana kimi əl çəkməmək, fəaliyyətini davam etdirmək. [Hacı Əhməd:] *Bir iynəmə kimi sataram, işi yeridərəm.* C.Cabbarlı. **İşim (işin) yoxdur** – qarışmıram (qarışma), mənə (sənə) dəxli yoxdur. *Siz* [institutda] *on beş-iyirmi yaşında müsəlman qızları ilə görüşdünüz və danışdınız, onda işim yoxdur, amma söz burasındadır ki, danışdınız.* C.Məmmədquluzadə. **İşin içindən çıxmaq** – hər hansı bir yolla çətin, mürəkkəb vəziyyətdən çıxmaq. *Ər-arvad çənə-boğazda, mollanı fikir götürür ki, işin içindən necə çıxsın.* “M.N.lətif.” [Rəhim xan:] [Sitarə] *məşrutəçinin qızıdır, deyə, işin içindən çıxarsan.* C.Cabbarlı. *Demək, Mirzə Qədir Nəsirin evlənmək xərcini verməklə işin içindən çıxa bilməyirdi.* S.Hüseyn. **İşin (işlərin) başı** – əsas səbəbkar. [Salman bəy:] *Arvadın dilini Allah da bilməz, yenə işlərin başı sənsən.* N.Vəzirov. [Qız:] *Dədəm də həmişə nənəmi döyür ki, işlər*(*in*) *başı sənsən.* Çəmənzəminli. **İşin qabağına kötük itələmək** – bir işə mane olmağa, əngəl törətməyə, qarşısını almağa çalışmaq. *Ancaq işin qabağına kötük itələyənlərə toxunmaq istəmirlər.* M.Hüseyn. **İşin olanı** – həqiqət, gerçək, fakt. *İşin olanı budur ki, söylədim.* **İşin(iz) olmasın** – toxunma(yın), qarışma(yın), baş qoşma(yın). [Mirzə Salman:] *Mənim kağızlarımla işin olmasın.* S.Rəhman. **İşin ucunu (çəmini) tapmaq** – işin yolunu tapmaq, işə öyrəşmək, çətinlikləri aradan qaldırmağı öyrənmək. *Ay balam, niyə*

*Allahın gözündən düşmüsən, bir holavarla, qoy öküz işin çəmini tapsın..* S.Rəhimov. [Usta Murtuz:] [Şagird] *tikintinin fəndini öyrənsə, işin çəmini tapsa, ustaların əlini taxtaya bağlayacaq.* Mir Cəlal. **İşin üstündə olmaq** – idarə etmək, rəhbərlik etmək, dolandırmaq (toyda, yasda, məclisdə və s.-də). **İşini bilən** – öz xeyrini, mənfəətini güdən, tədbirli adam haqqında. *Molla Xəlil işini bilən bir adam idi.* S.Hüseyn. **İşini bitirmək** *məc.* – öldürmək. [Həsənağa:] *Hamısından yaxşısı, bunu mənə tapşırın, bu gecə gedib işini bitirim.* M.S.Ordubadi. *Nəriman .. bu adamın .. əllərini tutdu, dizi ilə boğazını basdı, işini bitirdi.* Mir Cəlal. **İşini gör! İşinə var! İşində ol!** – əhəmiyyət vermə, fikir vermə, işin yoxdur. *Yeri ey bivəfa, işinə var sən; Ömrümüzə xələl qatdığın yetər.* Q.Zakir. **İşini görmək** – öz təsirini göstərmək. [Gültəkin:] *Aydıncığım, təlaş gecdir, artıq hər şey keçmiş, .. zəhər işini görmüşdür.* C.Cabbarlı. **İşini qatmaq** – b a x **işini bitirmək**. **İşini möhkəm tutmaq** – görəcəyi işin nəticəsini göz qabağına alaraq tədbirli hərəkət etmək, hərtərəfli düşünüb hərəkət etmək. **İş(lər)i yoluna qoymaq** – işi qaydaya salmaq, yerbəyer etmək, nizama salmaq. [Nadir bəy:] *Əlimdəki işləri yoluna qoya bilsəydim, artıq burada durmazdım.* H.Cavid. **Özünə iş açmaq, özünü işə salmaq** – düşünməməzlik nəticəsində özünü çıxılmaz vəziyyətə, dolaşığa, xatalı işə sövq etmək. *Dinməli və mübahisəyə girişməli vaxt deyildi, Kosa .. özünə iş açmışdı.* S.Rəhimov. [Camal:] *Öz-özümü işə salmadım?* S.Rəhman.

**İŞAN** *is.* Ruhani, din xadimi, molla. *Yazdığıma yalan-palan qatmaram; İşan kimi rüşvət pula yatmaram.* M.Ə.Sabir. *Hər gün itib-batmadadır xanları; Mollaları, şeyx və işanları.* Ə.Nəzmi.

**İŞARANTI** *is.* Uzaqdan görünən işıq nöqtəsi; işıqucu.

**İŞARASI** *zərf* İşin arası, iş görülən zaman. *İşarası evə qaçmaq.*

**İŞARƏ** *is.* [*ər.*] 1. Əlamət, nişanə, iz. *Övrətlərimizin indiki əhvalını nəzərə alsaq, .. bir işarə də tapa bilmərik ki, arvadlarımızın hüququ kişilər tərəfindən pozulmuş ola.* C.Məmmədquluzadə. // Rəmz, emblem. *Oraq kəndliyə, çəkic də fəhləyə işarədir.* S.Rəhimov.

2. Bir şeyi qaş-göz, əl, barmaq və s. ilə göstərmə, anlatma, bildirmə, him-cim. *Aşıq Cünun işarədən başa düşdü ki, sirri gizlin saxlamaq lazımdı.* "Koroğlu". *Arvadın işarəsi ilə nökərləri içəri daxil olub, padşahın qollarını bərk bağlayıb zindana salırlar.* (Nağıl). ☐ **İşarə etmək (vermək)** – bir şeyi əl, qaş-göz və s. ilə bildirmək, göstərmək, anlatmaq. *Nəbi özünü karlığa vurub, ona yaxın gəlməsini əli ilə işarə edir.* "Qaçaq Nəbi". *Ey ruhi-rəvan, mən edərəm can sənə təslim; Gər guşeyi-əbru ilə etsən sən işarə.* S.Ə.Şirvani.

3. Siqnal, xəbərdarlıq. *Şübhəsiz ki, mən Qızıl Arslanın bir işarəsindən asılıyam.* M.S.Ordubadi. ☐ **İşarə vermək** – siqnal vermək. *Münsif heyəti başçısı əlindəki kiçik qırmızı bayraqla işarə verdi.* M.Rzaquluzadə. *Gəmi harada olursa olsun, radiomayakın verdiyi işarələrlə öz istiqamətini təyin edə bilər.* "Radiolokasiya".

4. Kinayə, eyham. *İşarə ilə bildirmək.* ☐ **İşarə vurmaq** – sözü, fikri üstüörtülü, eyhamla demək, bildirmək. *Tahir bu xüsusda Cəmilə işarə vurmaq istəyirdisə də, usta Ramazanın duyuq düşəcəyindən çəkinir, dinmirdi.* M.Hüseyn. *Telli arvadın Qaraşa işarə vurduğu aydın idi.* M.İbrahimov. *O, mənim nəyə işarə vurduğumu duyurdu.* İ.Əfəndiyev.

◊ **İşarə anlayan** – tez başa düşən, arif. *Kişi dövlətinə pasiban gərək; İşarə anlayan, söz qanan gərək.* Q.Zakir. **İşarəyə bənd olmaq** – hazır vəziyyətdə gözləmək, əmrə müntəzir olmaq. *Üsyançılar işarəyə bənddirlər. – Qoca mürəttib kiçik bir işarəyə bənddi.* M.Hüseyn. **Durğu işarələri** – b a x **durğu**.

**İŞARƏLƏMƏ** "İşarələmək"dən *f.is.*

**İŞARƏLƏMƏK** *f.* İşarə vurmaq. // İşarə (nişan) qoymaq.

**İŞARƏLƏNMƏ** "İşarələnmək"dən *f.is.*

**İŞARƏLƏNMƏK** *məch.* İşarə qoyulmaq (vurulmaq). // Nişan qoyulmaq (vurulmaq).

**İŞARƏLİ** *sif.* 1. Başqalarından ayrılmaq üçün işarə (nişan) qoyulmuş, işarəsi olan. *İşarəli səhifə. İşarəli qab.*

2. *məc.* Üstüörtülü, kinayəli, eyhamlı. *İşarəli söz. İşarəli danışıq. – O vaxtdan sonra Leylək Ələmdar Müqim bəy Cavanşirlə az görüşməmiş, onların arasında işarəli danışıqlar az olmamışdı..* S.Rəhimov.

**İŞARƏSİZ** *sif.* İşarəsi olmayan, işarə (nişan) qoyulmamış.

**İŞARƏT** b a x **işarə**. *Bir yar ki dərd bilər olsa; Göz-qaş işarəti neylər?* Aşıq Abas. *İşarət elədim, dərdimi bildi; Gördüm həm gözəldi, həm əhli-dildi.* Aşıq Ələsgər. *Qonaq çadranın altından başını bulayıb, əli ilə işarət elədi ki, yox belə iş olmaz.* E.Sultanov.

**İŞARMA** "İşarmaq"dan *f.is.*

**İŞARMAQ** *f.* Xəfifcə işıldamaq, işıq vermək. [Xudayar bəyin] *papağının altdan gözləri elə işarır ki, adamın canına vahimə oturur.* C.Məmmədquluzadə. *..Bağın qapısında yanan lampa .. işarırdı.* M.S.Ordubadi. *Hisli dirəkdən asılmış neft çırağı tövlənin dibində tüstülənə-tüstülənə işarırdı.* Ə.Abasov. // Parlamaq, işıldamaq. *Sarmaşıq zoğutək qıvrım sallanan; Buruq saçlarında işarır yağış.* B.Vahabzadə.

**İŞARTI** b a x **işarantı**.

**İŞARTMA** "İşartmaq"dan *f.is.*

**İŞARTMAQ** b a x **işıqlandırmaq**. *O, sanki ümidlərini işardan bir qüvvə ardınca getdi.* Mir Cəlal.

**İŞBACARAN, İŞBİLƏN** *sif.* Bacarıqlı, təcrübəli, qabiliyyətli, əlindən iş gələn. [Kətxuda] *bilirdi ki, İnmirə camaatının şəhərdə yaxşı işbilən, oxumuş adamları vardır.* N.Nərimanov. [Məcid:] *Mənə də bir dənə işbilən arvad lazım idi..* B.Talıblı. [Böyük oğul:] *Qonşumuz Kəblə Hüseynqulu da işbilən adamdır.* Qantəmir. // İs. mənasında. [Müəllim:] *Nə qədər olsa, işbilənlərin çoxusu: alimlər, incinerlər hamısı şəhərdə yaşayırlar.* Ə.Haqverdiyev. *Naznaz bu fikirdə idi ki, Qaraşın yaxşı gələcəyi var, ağıllıdır, ağırdır, işbiləndir, sağlam və gəncdir.* M.İbrahimov.

**İŞBAZ** *is.* Özünü yalandan işgüzar göstərən adam.

**İŞBAZLIQ** *is.* İşin prinsipial, ictimai-siyasi cəhətini nəzərə almayan, zahiri işgüzarlıq.

**İŞCİL** *sif.* İşləməyi sevən; zəhmətsevən, işgüzar, çalışqan, işlək. – *Pah! İnsan da belə işcil olar? Əjdaha kimidir!* Mir Cəlal. [Kərim:] *İşcil olmasına söz yoxdur.* İ.Əfəndiyev. // İs. mənasında. *Hər sahədə bir dalğa və hər daş; İşcilə qurur bir yeni aləm.* M.Müşfiq.

**İŞCİLLİK** *is.* Zəhməti, işi sevmə; çalışqanlıq, işgüzarlıq.

**İŞÇİ** *is.* 1. Zehni və fiziki əməyin hər hansı bir sahəsində çalışan adam. *Fəal işçi. Qabaqcıl işçilər. – Mirzağa onu istirahət evinin bir xidmətçisi və ya məsul bir işçisi zənn etdi.* S.Hüseyn. // Hər hansı bir müəssisədə, idarədə xidmət edən, çalışan adam. *Ticarət işçisi. Poçt işçisi. Elmi işçi. – Qoçularla əlbir olan polis işçiləri özlərini görməməzliyə vururdular.* A.Şaiq. *Milis işçisi də qayğı göstərib onu ötürmək qərarına gəlmişdi.* H.Seyidbəyli.

2. Fəhlə. *İşçilərlə kəndlilərin ittifaqı.* [Eyvaz:] *Mənim həqiqət sandığım kitabda .. işçi var, fabrikant var.* C.Cabbarlı. *Mən işçi firqəsi nümayəndəsiyəm.* H.Nəzərli.

◊ **İşçi qüvvəsi –** fəhlələr, işçilər. *Bu işi görmək üçün işçi qüvvəsi lazımdır. İşçi qüvvəsi çatışmır. Mexaniki qüvvə ilə görülməsi mümkün olmayan işlər üçün .. əlavə işçi qüvvəsi verilmişdi.*

**İŞÇİ-KƏNDLİ** *top.* Fəhlə və kəndli, zəhmətkeş, əməkçi. [Mirzə Həsən:] *İndi təzə hökumət gözlənir, zəhmətkeşlər hökuməti, işçi-kəndli hökuməti.* Ə.Haqverdiyev. [Hadı lələ:] *Onların fikri işçi-kəndli sinfini azad etməkdir.* S.S.Axundov. *Bu hadisədən iki gün sonra .. işçi-kəndli qadınlar qurultayı açıldığından Məsmənin o axşam məruzəsi var imiş.* S.Hüseyn.

**İŞDƏK** *is. dan.* İş, əməl, gizli iş, kələk. [Namaz:] *Mənim əlimin altında çox adamların işdəkləri var.* Ə.Haqverdiyev. [Dərviş:] *Dünyanın .. işdəkləri çarpaz şəkillidir.* A.Divanbəyoğlu.

**İŞEMİ́YA** *is.* [*yun.*] *tib.* Yerli qan azlığı; toxumalara lazımı qədər qanın çatmaması. *Mərkəzi sinir sistemi və ürək əzələsi işemiyaya daha tez tutulur.*

**İŞƏGƏLƏN** b a x **işəyarayan**.

**İŞƏMUZD** *is. iqt.* Fəhləyə gördüyü işin (istehsal etdiyi məmulatın) miqdarına görə verilən əmək haqqı. *İşəmuzd əmək haqqı.*

**İŞƏMUZDÇULUQ** *is. iqt.* Müəssisələrdə işəmuzd əmək haqqının tətbiqi.

**İŞƏYARARLILIQ** *is.* İşəyarar şeyin hal və keyfiyyəti.

**İŞƏYARAYAN, İŞƏYARAR(LI)** *sif.* Yararlı, lazımlı, gərəkli; fayda verə bilən. *İşəyarar şey.*

**İŞGƏNCƏ** *is.* [*fars.*] Vəhşi və amansız üsullarla verilən cismani əzab. [Qətibə:] [Hüsaməddin] *azacıq bir işgəncə nəticəsində bizim bütün sirlərimizi Qızıl Arslana verəcəkdir.* M.S.Ordubadi. *Gör necə vermiş rəiyyət bəylə pəncə-pəncəyə; Kəndliyə, rəncbərlərə bax, bir olan işgəncəyə.* Ə.Qəmküsar. [Qaragün:] [Şübhəli adamı] *sabaha qədər işgəncələrlə dindirdim.* M.Rzaquluzadə. // Ümumiyyətlə, əzab, əziyyət, zülm. *Burdan uzaq Gəncədir; Zülfün pəncə-pəncədir; Ölüm bir dəfəlikdir; Ayrılıq işgəncədir.* (Bayatı). *Nəyə gərək bahar, – dedim, – nəyə gərək əyləncə; Qan qardaşım zalımlardan görürkən min işgəncə.* S.Rüstəm. *Gülnaz və Səriyyə xala gecə yarısı, ayyarımlıq dözülməz əzab və işgəncədən sonra ilk dəfə rahat yataraq yuxuya getdiyi zaman* [Səadət] *hələ gəlməmişdi.* M.İbrahimov. ☐ **İşgəncə etmək (vermək)** – əzab vermək, əziyyət vermək, çox incitmək. [Xacə Nizam:] *Mən də bir xeyli üzüldüm o gecə; Etdilər öncə bir az işgəncə.* H.Cavid. *Necə ola bilər ki, ata-ana öz yeganə övladına bu qədər işgəncə versin?!* İ.Hüseynov.

**İŞGƏNCƏLİ** *sif.* Əzablı, əziyyətli, ağır, dözülməz; əzab və əziyyətlə dolu. *Bizim gözlərimiz önündən uzun, işgəncəli bir insan həyatı gəlib keçir.* M.Hüseyn.

**İŞGƏNƏ** *is.* [*fars.*] Yarıbişmiş yağlı ətin, toyuğun suyu. // Hələ cızdaq halına gəlməmiş sulu quyruq tikələrindən ibarət yemək. *Qovurma, kabab, işgənə, cızdaq iyi küçəni, meydanı, meşəni bürüyürdü.* Mir Cəlal.

**İŞGİL¹** *is. məh. dan.* 1. Cəftə, qarmaq. [*Kosa*] .. *şüşənin sınıq yerindən əlini içəriyə saldı və işgili tərpətdi.* S.Rəhimov.

2. Arabanın qolu ilə boyunduruğu birləşdirən nazik ağac. // Arabanın təkəri çıxmamaq üçün oxunun ucuna keçirilən ağac parçası.

**İŞGİL²** *is.* 1. Zənn, şübhə, güman.

2. Çətinlik, maneə, əngəl, çətin vəziyyət. *İşgildən çıxmaq.* ☐ **İşgil olmaq (törətmək)** – mane olmaq, əngəl yaratmaq. *İşgil törətmək onun köhnə peşəsidir.* **İşgilə düşmək** – çətinliyə, çətin vəziyyətə düşmək. **İşgilə salmaq** – əngələ salmaq. *Ol badəni kim, əqlimi başdan aparıbdır; Sandın məni, mən sadədili işgilə saldın.* Qövsi.

3. *məc.* Çatışmazlıq, nöqsan, əngəl. [Mirzə Dadaş:] *Camaat, görürsünüz ki, bu oğlanın başında bir balaca işgil var.* N.Vəzirov.

**İŞGİLBAZ** *sif. məh.* Hiyləbaz, kələkbaz, fırıldaqçı. *İşgilbaz adam.*

**İŞGİLLƏMƏ¹** "İşgilləmək¹"dən *f.is.*

**İŞGİLLƏMƏ²** "İşgilləmək²"dən *f.is.*

**İŞGİLLƏMƏK¹** *f. məh.* İşgil salmaq, işgil keçirmək. *Arabanı işgilləmək.*

**İŞGİLLƏMƏK²** *f.* Bir işin düzəlməsinə mane olmaq, əngəl törətmək, pər qatmaq.

**İŞGİLLİ¹** *sif. məh.* İşgili olan, işgillə bağlanmış, cəftələnmiş. *İşgilli qapı.*

**İŞGİLLİ²** *sif.* Əngəlli, çətin, şübhəli. *İşgilli iş.*

**İŞ-GÜC** b a x **iş** 1 və 3-cü mənalarda. *Oğul, işin-gücün bu vaxtında bilmirəm gedim, necə gedim, getməyim, necə getməyim.* "Aşıq Ələsgər". [Hacı Murad:] *Oğul, .. yenə irəliki kimi işə-gücə get.* S.S.Axundov. *Deyib-danışaram şümşad boyundan; İşindən-gücündən, təzə toyundan.* M.Rahim. ☐ **İşdən-gücdən eləmək** – avara qoymaq, işindən ayırmaq. **İşdən-gücdən olmaq** – hər hansı bir səbəbə görə işindən avara olmaq, işini buraxmağa məcbur olmaq, heç bir iş görə bilməmək. [Qulu:] *Bu da kasıb oğlandır, neçə gündür işdən-gücdən olubdur.* N.Vəzirov. **İşə-gücə yaramaq** – xeyir vermək, köməyi dəymək, kara gəlmək, işə yaramaq. *Bu zaman üç oğlundan heç birisi nə .. toxum daşıyır, nə də bir saxsı su gətirib işə-gücə yarayırdı.* S.Rəhimov. **İşini-gücünü buraxmaq** – heç bir işlə məşğul olmamaq, işindən əl çəkmək, avaralanmaq. [Əsəd bəy:] *..Gələn gündən işin-gücün buraxmış, bir tüfənglə ora-buranı gəzir.* C.Cabbarlı.

**İŞGÜZAR** *sif.* 1. Bacarıqlı, işbacaran, işdə təcrübəsi olan. *İşgüzar müdir. – Burada gözə dəyən hər şey otaq sahibinin işgüzar bir adam olduğunu göstərirdi.* M.Hüseyn. *Əbil .. Muxtar Zeynalovu işgüzar və gözütox bir adam kimi tanıyırdı.* Ə.Vəliyev. [Nuriyyə:] *Sədriniz*

*işgüzar adama oxşayır.* İ.Əfəndiyev. // Zəhmətsevən, işləyən, işcil, işləməyi sevən, təşəbbüskar. *Qoçaq və işgüzar qızlardan olduğuna görə, qayınatası Mələkdən əl çəkməyib on üç yaşından kiçik oğluna nikah etdi.* A.Divanbəyoğlu. *Küçə sürətlə ora-bura gedən işgüzar adamlarla dolu idi.* S.Rəhman.

2. Əməli əhəmiyyəti olan, iş üçün faydası olan; ciddi. *İşgüzar səfər. Konfrans işgüzar* (z.) *şəraitdə keçdi.* – [Mayor:] *Cavanşir bəylə işgüzar söhbətimiz var.* Ə.Məmmədxanlı.

**İŞGÜZARLIQ** *is.* İşgüzar olma; zəhmətsevərlik, işcillik, təşəbbüskarlıq, bacarıqlılıq. *Bülənd zarafatyana otağa rişxənd etməklə bərabər, anasının belə işgüzarlığına təəccüb etmişdi.* Ə.Əbülhəsən. *İşgüzarlıq mühüm iradi keyfiyyətlərdən biri olub, başlanan hər hansı bir işi .. tədriclə, ardıcıl olaraq axıra qədər icra etməkdir.* "Psixologiya oçerkləri".

**İŞĞAL** *is.* [*ər.*] Hər hansı bir dövlətin hərbi qüvvələri tərəfindən başqa dövlətin torpağının tutulması. *Aprel işğalı. – Azərbaycan Atabəylərinə məxsus torpaqlar tamamilə xarəzmlər, İraq və iranlıların işğalı altında idi.* M.S.Ordubadi. ☐ **İşğal etmək** – 1) tutmaq, zorla soxulmaq. *Özgənin torpaqlarını işğal etmək;* 2) *köhn.* məşğul etmək. *Əski xatirələr fikrimi işğal etmişdi.* S.Hüseyn. *Məcidin təbrik etməyi Nadiri bir az düşündürdüsə də, amma qəlbini işğal edən hissiyyatın bu tezliklə bu rəngə girməsinə .. əhəmiyyət vermədi.* B.Talıblı.

**İŞĞALÇI** *is.* Özgə torpaqlarını zorla tutan, işğalçılıq siyasəti yeridən (adam, dövlət və s.). *Yadelli işğalçılara qarşı mübarizə aparmaq.* – [Uluq bəy:] *Elə dərs verərik işğalçılara; Bir də üz çevirməz bu şən diyara.* A.Şaiq. *Azərbaycan xalqı heç bir zaman yadelli işğalçılara boyun əyməmiş, heç bir zaman öz mənliyini, öz milli vüqarını itirməmişdir.* İ.Əfəndiyev.

**İŞĞALÇILIQ** *is.* İşğal siyasəti yürütmə; istilaçılıq. *İşğalçılıq siyasəti.*

**İŞIĞADAVAMLI** *sif.* İşığın təsiri ilə dəyişməyən, işıq təsir etməyən, işıqdan qorxmayan. *İşığadavamlı boyalar* (*rənglər*).

**İŞIĞADAVAMLILIQ** *is.* İşığadavamlı şeyin hal və keyfiyyəti. *Rənglərin işığadavamlılığı.*

**İŞIĞAHƏSSAS** *sif.* İşığa həssas olan, işıqdan təsirlənən. *İşığahəssas kağız. İşığahəssas sinirlər.*

**İŞIĞAHƏSSASLIQ** *is.* İşığa həssas olma xassəsi, işığa həssas olma.

**İŞIQ** *is.* 1. Ətrafı işıqlandıraraq, onu gözlə görünəcək hala salan şüa enerjisi; nur, ziya. *Gün işığı. Ay işığı. Lampa işığı. Fənər işığı. İşıq şüası. – Yağışın arasında küçələrdə yanan elektrik işıqları tutqun bir ziya nəşr edirdilər.* S.Hüseyn. *Şam işığında bir dəstə kefli Cumanın nəzərini cəlb etdi.* Ə.Əbülhəsən. *Qapı aralandı və içəridən ağ qarın üstünə sarımtıl-qırmızı bir işıq zolağı düşdü.* Q.İlkin. ☐ **İşıq almaq** *məc.* – 1) qüvvət almaq, ilham almaq; 2) daha qüvvətli işıq mənbəyi vasitəsilə işıqlanmaq. *Huri, mələk ola bilməz sənə tay; İşıq alır camalından ərşdə ay.* Aşıq Mirzə. **İşıq olmaq** – işıqlanmaq, nurlanmaq. *Söz deyən aşiq oldu; Elə yaraşıq oldu; Bu gün yar bizə gəldi; Evimiz işıq oldu.* (Bayatı). **İşıq saçmaq** – şüalanmaq, ətrafa işıq vermək, işıq yaymaq. *Tində yanan bir fənər ətrafa zəif işıq saçırdı.* S.Rəhman. **İşıq salmaq** – 1) işıqlandırmaq, nurlandırmaq. *On dörd gecəlik ay qayalara işıq salıb, vahiməli kölgələr təşkil edirdi.* H.Nəzərli. *Bəzən olur həyatımın dağlarını duman alır; O gün sənin titrək laylan yollarıma işıq salır.* Ə.Cavad; 2) parıldamaq, şəfəq saçmaq, bərq vurmaq. *Üzüyün qaşı işıq salır.* – [Salamov:] *Bunlar* [brilyantlar] *başqa şeydir, əntiqə şeydir, qaranlıqda işıq salır.* C.Cabbarlı. **İşıq vermək** – 1) işıqlandırmaq, işıq saçmaq, nurlandırmaq. *Ay doğdu işıq verdi; Yara yaraşıq verdi; Sinəndən doğan ulduz; Gözümə işıq verdi.* (Bayatı). [Pərşan] *göylərin axşam parıltısında halələnmiş ay kimi işıq verirdi.* M.İbrahimov; 2) *məc.* qüvvət vermək. *Milyonların gücünü bir məqsədə yönəltdin; İşıq verdin gözünə, qüvvət oldun qoluna.* R.Rza. **İşıqdan düşmək** – 1) işığı azalmaq, parıltısı sönmək, zəifləmək. *Dan yeri yenicə sökülürdü, .. ay və ulduzlar günün parlaq şüaları qarşısında işıqdan düşüb, sönük bir halda gözdən itirdilər.* Çəmənzəminli; 2) qüvvətdən düşmək, zəifləmək (göz haqqında).

2. Günün hər hansı bir vaxtı üçün səciyyəvi olan aydınlıq. *Gündüz işığı. Sabah*

*işığı. Axşam işığı* (alaqaranlıq). // Dan yeri, şəfəq. *Sabahın işığı süzdü içəri; Dostlara göstərdi doğan səhəri.* M.Rahim. *Üfüqdə səhər şəfəqinə bənzər bir işıq parıldayır.* M.Rzaquluzadə.

3. Lampa, fənər, şam və s. işıq mənbəyi mənasında. *İşığı yandırmaq. İşığı keçirmək. İşığı irəli tut. – Nüşapəri xanımın ürəyinə şək damdı, işığı tutub, ona tərəf üz qoydu getməyə.* (Nağıl). *..Otağımdakı işığı keçirəndə xəfif, qırmızı bir parıltının pəncərə şüşələrində titrədiyini görürdüm.* Ə.Məmmədxanlı.

4. İşıq çıxan yer, işıq yer, işıq düşən yer, işıqlanmış yer. *Dalı işığa tərəf durmaq. Dərmanı işığa qoyma.*

5. *məc.* Ağ gün, aydınlıq, xoşbəxtlik, fərəh mənasında. *İşığa çıxasan.*

6. *məc.* Maarif, mədəniyyət, ürfan, tərəqqi mənasında. *İndi gənclik Bakını sevir. İndi Bakı onlar üçün işıq və bilik mənbəyi olmuşdur.* M.Hüseyn. *İşıq, nur mənbəyi gözəl yurdumuz; Getdiyin yollara nurlar səpələr.* N.Rəfibəyli. □ **İşıqdan qorxan** – maarifdən qorxan, maarif düşməni, tərəqqi düşməni; cəhalətpərəst. *..İşıqdan qorxan və millətin ayılmağından xof və əndişə edən mülkədar, bəylərin və ağaların mərhəmətindən* [kənd camaatı] *bir növ əxlaqsız olublar.* F.Köçərli.

7. *məc.* Aydınlıq, təmizlik mənasında. *Dağlar başı işıqdır; Gün dağa yaraşıqdır; Qaynanam məni sevmir; Oğlu mənə aşıqdır.* (Bayatı).

◊ **İşığı düşmək** – çox gözəl, göyçək, ağbəniz qadın (qız) haqqında. *Qız o qədər gözəldi ki, işığı düşürdü çəmənə, qazlar ürküb otlaşmırdılar.* (Nağıl). **İşıq müalicəsi** – işıq şüalarının (günəş, ya süni işıq mənbəyindən çıxan şüaların) müalicə məqsədi ilə tətbiqi. **İşıq siqnalı** – işıq vasitəsilə verilən siqnal, işarə. **İşıq üzü görməmək, işıq üzünə həsrət qalmaq** – daima qapalı bir yerdə oturub, açıq havaya çıxmamaq, ya çıxa bilməmək. **Göz verib işıq verməmək** – b a x **göz**. **Gözünə işıq gəlmək** – b a x **göz**.

**İŞIQHAİŞIQ(DA)** *zərf* Dan yeri sökülməyə başlayanda, hava işıqlaşmağa başlayanda. *İşıqhaişıqda qara damın hisli bacasından içəri işıq düşdü.* S.Rəhimov.

**İŞIQLANDIRICI** *sif.* Ətrafı işıqlandıran, süni işıqlandırmağa məxsus. *İşıqlandırıcı cihaz. İşıqlandırıcı raket.*

**İŞIQLANDIRILMA** "İşıqlandırılmaq"dan *f.is.*

**İŞIQLANDIRILMAQ** *məch.* 1. İşıq edilmək, elektrik işığı çəkilmək. [Əhməd:] *Bütün kəndlərimiz başdan-başa işıqlandırılsın.* S.Rəhimov.

2. *məc.* Şərh etmək, şərh edilmək; aydınlaşdırılmaq. *Məsələ mətbuatda işıqlandırılmışdır.*

**İŞIQLANDIRMA** "İşıqlandırmaq"dan *f.is.*

**İŞIQLANDIRMAQ** *f.* 1. İşıq eləmək, işıq salıb aydın etmək, görünəcək hala salmaq. *Tapdıq axır Lizalartək necə cananələri; Çilçıraqlarla işıqlandırırıq xanələri.* M.Ə.Sabir. *Fərhad bəy qabaqda gedirdi. Kürəyinin ortasını ay işığı işıqlandırırdı.* Qantəmir. *Sahil boyu düzülmüş fənərlərin əksi dənizdə gəzən yelkənli qayıqları işıqlandırırdı.* S.Rəhman. // Bir şeyin işığını müəyyən səmtə, yerə və s.-yə yönəltmək. *Evin küncünü işıqlandırmaq. Üzünü işıqlandırmaq.* // Elektrik işığı ilə təmin etmək, işıq çəkmək. *Küçələri işıqlandırmaq. Parkı işıqlandırmaq.*

2. *məc.* Canlandırmaq, isindirmək, hərarətləndirmək, ruhlandırmaq. [Komandirin] *qaradinməz sifətini xəfif bir gülüş işıqlandırırdı.* Ə.Vəliyev.

3. *məc.* İzah etmək, təsvir etmək, yazmaq, göstərmək, şərh etmək. *Nömrədə əsas məsələləri işıqlandırmaq. Nitq mədəniyyəti məsələlərini qəzetdə geniş işıqlandırmaq lazımdır. – "Kəşkül" hər məsələdən yazırdı, iqtisadi, ictimai, siyasi, ədəbi mövzuları işıqlandırırdı.* M.İbrahimov.

**İŞIQLANMA** "İşıqlanmaq"dan *f.is.*

**İŞIQLANMAQ** *f.* 1. İşıq olmaq, aydınlaşaraq görünə bilmək, işıqla dolmaq. [Park] *yalnız yeni çıxmaqda olan ayın ziyası ilə xəfifcə işıqlanmışdı.* S.Hüseyn. *Gecə tonqal yanardı; Qazma işıqlanardı.* M.Seyidzadə. // Məc. mənada. *Cahan işıqlanacaq sülh ilə, səadət ilə.* Ə.Vahid.

2. Səhər açılmağa başlamaq, dan yeri sökülmək. (Bu mənada çox vaxt "hava" sözü ilə). *Gözlərimi açdım, gördüm hava təzə*

*işıqlanır.* C.Məmmədquluzadə. *İndi də ki saat dörddür, hələ işıqlanmayıb.* Ə.Haqverdiyev. *Hacı Qasım işıqlanmamışdan qabaq yuxudan oyandı..* E.Sultanov. *Hava işıqlanana oxşamırdı.* Mir Cəlal.

3. *məc.* Hər hansı bir hissin təsiri ilə üzündə, gözlərində sevinc əlaməti zahir olmaq, ruhlanmaq, canlanmaq. *Qarı pulu görən kimi gözləri işıqlanıb dedi: – Mənim gözüm üstə!* "Aşıq Qərib". *Bu səsləri Lütfəli eşidən kimi .. şadlığından işıqlanıb güldü.* İ.Musabəyov.

**İŞIQLAŞMA** "İşıqlaşmaq"dan *f.is.*

**İŞIQLAŞMAQ** *f.* 1. İşıqlanmaq, daha işıq olmaq, işığı artmaq. *Deyəsən, hava bir az işıqlaşan kimi olmuşdu.* M.Rzaquluzadə.

2. B a x **işıqlanmaq** 2-ci mənada. *Nə yerdə bir ocaq, nə göydə bir şam! Göz-gözü görməyir .. işıqlaşanda.* Ə.Cəmil. *Kotançılar işıqlaşanda qalxır..* B.Bayramov. *Gün çıxmamış olsa da, hava işıqlaşırdı.* M.Süleymanov.

**İŞIQLATMA** "İşıqlatmaq"dan *f.is.*

**İŞIQLATMAQ** b a x **işıqlandırmaq**. *Əziz balalar! ..Zəmanənin təqazasi, daha doğrusu, hürriyyətin günü biz gedən qaranlıq, məşəqqətli yolları işıqladıb asan etdi.* N.Nərimanov. *Düşərgədə işıqlat sən də yaşıl bağları.* M.Rahim. *Ay çıxıb bağçanı işıqlatmışdı.* Ə.Məmmədxanlı. // Məc. mənada. *Onun qoca simasını; İşıqlatdı bir məna.* N.Rəfibəyli. *Ay kimi Füzuli də; İşıqlatdı hər yeri.* B.Vahabzadə.

**İŞIQLI** *sif.* 1. Güclü işıq verən, işıq saçan, işığı yaxşı olan, parlayan. *İşıqlı lampa. – Havanın üzü ləkəsiz olduğu üçün işıqlı ulduzlar ötədə-bəridə fərq edilirdi.* S.Hüseyn. *Ay işıqlı, göy ulduzlu, yol aydın; Könlüm evi çıraqbandır bu gecə.* R.Rza.

2. Yaxşı işıqlandırılmış, işıqla dolu, çox işıq düşən. *İşıqlı otaq. İşıqlı salon. – Sarayın geniş, işıqlı, yaraşıqlı foyesində neft qabaqcıllarının .. şəkilləri vurulmuş böyük şərəf lövhəsi var idi.* M.Rzaquluzadə. *Mehriban .. uzun, işıqlı dəhliz ilə gedib sola döndü..* H.Seyidbəyli.

3. Şəffaf, parlayan, təmiz, ləkəsiz. *İşıqlı şüşə. İşıqlı səma. – Xoşladığım bir gecə; yerlər, göylər işıqlı; Ay bir sərxoş göz kimi, ulduzlar yaraşıqlı.* M.Müşfiq. *Elə bil çayın suyu aya qədər ucalmaq, aydın səmanın işıqlı sifətini öz bulaşığına boyamaq istəyirdi.* Ə.Vəliyev.

4. *məc.* Fərəhli, məsud, xoşbəxt. *İşıqlı gələcək. İşıqlı günlər. – Bir işıqlı dünya var – haqq-ədalət dünyası!* Ə.Cəmil. // *məc.* Yaxşı, gözəl, nəcib. *Həyatın işıqlı və qaranlıq cəhətləri.*

5. *məc.* Açıq, aydın, parlaq (fikir, ağıl haqqında). [Zeyd:] *Qeys işıqlı bir zəkadır, cəhalət ona məcnun damğası vurur.* Ə.Məmmədxanlı.

◊ **İşıqlı dünya** – yaşadığımız dünya, aləm. *Nağıllarda Simurq quşu qəhrəmanı qaranlıq dünyadan işıqlı dünyaya çıxarır. – Dərviş ucaboylu, arğaz, uzunsaçlı və saqqallı idi. Gözlərindən və üzündən bunun yuxu və məşəqqət və işıqlı dünyada cəhənnəm oduna düçar olduğu görünürdü.* A.Divanbəyoğlu.

**İŞIQLIQ** *is.* 1. İşıqlı şeyin halı, işıqlanma dərəcəsi. *Lampanın işıqlığı.* // İşıq, parlaqlıq.

2. Adətən kənd evlərində, daxmalarda, pəyədə, tövlədə və s.-də işıq gəlmək üçün yer, balaca pəncərə. *..Daxmanın bir tayqanad qapısı, bir də divarın başında xırda bir işıqlığı vardı.* S.Rəhimov.

3. *məc.* Maarif, mədəniyyət, elm, ürfan. ☐ **İşıqlığa çıxmaq** *məc.* – 1) maariflənmək, mədəniləşmək. *Əziz balalar! ..Bizim qaranlıqdan işıqlığa çıxmağımıza mane olurdular.* N.Nərimanov; 2) xoşbəxt olmaq, xoşbəxtliyə çıxmaq. **İşıqlığa çıxasan (çıxasınız)** – xoşbəxtlik, səadət, yaxşı gün arzusu. [İmran:] *Ay səni görüm, işıqlığa çıxasan!* M.Hüseyn.

**İŞIQOTU** *is. bot.* Dağlıq yerlərdə, çəmən və kolluqlarda bitən çoxillik ot-bitki.

**İŞIQÖLÇƏN** *is. fiz.* Hər hansı işıq mənbəyinin gücünü ölçmək üçün cihaz; fotometr.

**İŞIQSAÇAN** *sif.* 1. Özündən işıq verən, işıq şüaları buraxan; ətrafı işıqlandıran. *İşıqsaçan cisimlər. İşıqsaçan bomba.*

2. *məc.* Nurlandıran, nursaçan. [Sevil:] *Mədəniyyət sarayı mədəniyyətin sönməz ocağı, ətrafa işıqsaçan bir mayakdır.* S.Rəhimov.

**İŞIQSEVƏN** *sif. bot.* Günəş tutan, işıqlı, açıq yerləri sevən. *İşıqsevən bitkilər. İşıqsevən ağaclar.*

**İŞIQSIZ** *sif.* 1. İşığı olmayan, yaxud yaxşı işıq düşməyən. *İşıqsız otaq.* // *zərf* İşıq olmadan, lampa yandırmadan; qaranlıqda. *Niyə işıqsız oturmusan?* // *məc.* Cansız, həyat işartısı olmayan, ölgün, zəif. *İşıqsız göz.*

2. *məc.* Nadan, cahil, hüquqsuz, sevincsiz. *C.Məmmədquluzadə öz realist qələmi ilə Azərbaycan qadınlığının .. işıqsız, yazıq və qul həyatını qüdrətlə təsvir etmişdir.* M.İbrahimov.

**İŞIQSIZLIQ** *is.* 1. İşıq olmadığı hal və vəziyyət.

2. *məc.* Cəhalət, mədəniyyətsizlik, nadanlıq.

**İŞIQUCU** b a x **işıqyeri**. *Qoca usta yalnız Tahirin deyil, işıqucu gördüyü hər bir şagirdinin üstündə mehriban bir ata kimi əsməyə çoxdan adət eləmişdi.* M.Hüseyn.

**İŞIQVERİCİ** 1. *sif.* İşıqsaçan.

2. *is.* İşıqlandırıcı cihaz. *Bütün işıqvericilər lampa malları qrupuna aiddir.*

**İŞIQYERİ** *is.* Ümid yeri, ümid verən şey. *İkinci səbəb o idi ki, Mehdiqulunun umacağı vardı, işıqyeri görünürdü.* Mir Cəlal.

**İŞILDAĞ** *is. məh.* Dəniz kənarında ən hündür və görüş dairəsi geniş olan yerdə tikilmiş nişangah, mayak.

**İŞILDAQUŞ** *is. zool.* Qaranlıqda parıldayan cücü. *Əyilən yarpağında titrəyərək; Qonmaq istər .. işıldaquş min-min.* R.Rza.

**İŞILDAQUYRUQ** *is. zool.* Sərçəkimilər dəstəsindən parlaq, al-qırmızı quyruğu olan quş.

**İŞILDAMA** "İşıldamaq"dan *f.is.*

**İŞILDAMAQ** *f.* İşıq vermək, işıq saçmaq. *Yerlərdə işıldamır nə bir şam, nə bir ocaq; Göylərdə eşidilir ölüm nərəsi ancaq.* Ə.Cəmil. *Elektrik lampaları axşamın boz dumanları içərisində sönük bir parıltı ilə işıldayırdı.* Q.İlkin. // Parlamaq, parıldamaq, bərq vurmaq. *Üzüyün qaşı işıldayır. Şüşə işıldayır. – Hər işıldayana qızıl deməzlər.* (Ata. sözü). *Vaqif yağışdan sonra təmizlənib işıldayan otlara və çiçəklərə baxır, zövqlənirdi..* Çəmənzəminli. *Manqalın işığında onun xınalı dırnaqları və barmağındakı qızıl üzük işıldadı.* İ.Hüseynov.

**İŞILDATMA** "İşıldatmaq"dan *f.is.*

**İŞILDATMAQ** *f.* 1. Bir şeyi silməklə, yaxud üzərinə bir şey çəkməklə, sürtməklə parıldatmaq. *Şüşələri işıldatmaq. Döşəməni işıldatmaq. – Kəndə yetişəndən sonra Almaz uzunboğaz çəkməsini keçi piyi ilə yağlayıb işıldadır.* S.Rəhimov.

2. Parlatmaq, parıldatmaq. *Canavarlar bu yerləri hələ də adamsız sayaraq, gecələr çadırların ətrafında dolanır və alovlu gözlərini işıldadaraq, öz ruzilərini gözləyirdilər.* Ə.Sadıq.

**İŞIL-İŞIL**: **işıl-işıl işıldamaq (parlamaq, parıldamaq)** – par-par parıldamaq. *Pişiyin gözləri qaranlıqda işıl-işıl işıldayır. Üzüyün qaşı işıl-işıl parıldayır. – Dağlar, çəmənlər geyinir al, yaşıl; Yerlər, göylər parıldar işıl-işıl.* H.Cavid. *Ay aydınlıq; ulduzlar da; Parlayırdı işıl-işıl.* M.Dilbazi.

**İŞILTI** *is.* Zəif işıq. *Nə işıltı, nə də çıraq, nə bir qara daxma var; Hər yer bütün qalın qar.* A.Səhhət. *Enirəm qazmaya... Qazma soyuq, dar; Od-ocaq yoxsa da, bir işıltı var.* Ə.Cəmil. *Qar getdikcə daha şiddətlə yağır, solğun bir işıltı axşam qaranlığında əks edirdi.* Ə.Məmmədxanlı. // Uzaqdan görünən işıq nöqtəsi. *Hər iki yanda bir çağırımlıqda göz qırpan işıltı görünürdü.* M.Rzaquluzadə. ☐ **İşıltı gəlmək** – işıq görünmək, işıq seçilmək. *Yolçu qapı tərəfdən bir işıltı gəldiyini görüb, yavaş addımla yaxınlaşdı.* S.Rəhman. *Uzaqlardakı kəndlərdən ala-seyrək işıltı gəlirdi.* S.Rəhimov.

**İŞILTILI** *sif.* İşıltısı olan, işıldayan, parıldayan. *Rza bəy nədənsə hirslənib, geri daranmış və ortadan ikiyə bölünmüş işıltılı saçlarını qarışdırdı.* Ə.Vəliyev.

**İŞIRĞAN** *is. bot.* Toxumları ədviyyə kimi işlədilən bir bitki. *İşırğan bal verən bitkidir.*

**İŞKƏMBƏ** *is.* [*fars.*] Gövşəyən heyvanların ikinci mədəsi. *Gövşəyən heyvanlarda udulan yem işkəmbəyə daxil olaraq yumşalır, qarışır, əzilir.* "Ümumi zootexniya".

**İŞLƏDİCİ** *is.* 1. *xüs.* İşlədən, hərəkətə gətirən, işə salan.

2. B a x **işlətmə** 2-ci mənada. *İşlədici dərmanlar.*

**İŞLƏDİLMƏ** "İşlədilmək"dən *f.is. Maşınların işlədilməsi.*

**İŞLƏDİLMƏK** *məch.* 1. İstifadə edilmək, tətbiq edilmək, hərəkətə gətirilmək, işə salınmaq. *Cihazların işlədilmək qaydası.*

2. Danışıqda, yazıda istifadə edilmək. *Danışıqda qəliz sözlər işlədilməməlidir. Onun məqaləsində çoxlu termin işlədilmişdir.*

3. Sərf edilmək, istehlak edilmək. *Kağızın hamısı işlədilmişdir.*

4. İşləməyə məcbur edilmək, yaxud bir işdə istifadə edilmək, iş gördürülmək. *İxtisası üzrə işlədilmək.*

**İŞLƏK**[1] *sif.* 1. Zəhməti, işləməyi sevən, çox işləyən, daim işləyən, vaxtını işdə keçirən; fəal, çalışqan. *İşlək adam. Bu yerlərin camaatı işləkdir. – İşlək keçəl ərə gedər, pinti gözəl gora.* (Ata. sözü). *Qızxanım əri kimi işlək, xoşxasiyyətli, namuslu bir qadın idi.* S.S.Axundov. [Əliqulu:] *..Siz Əhməd Soltanzadə kimi işlək adamı bəyənmirsiniz.* M.Süleymanov. // Zəhmətkeş, fəhlə. *Qarı bir qədər susduqdan sonra: – Bəli, oğul, – dedi, – ..o dustaq isə, bala, istəyir ki, işlək adamlar, fəhlələr heç olmasa günbatanda evlərinə qayıtsınlar..* Ə.Məmmədxanlı.

2. Çox işləyən, gediş-gəlişli, hərəkət çox olan. *İşlək küçə. İşlək yol.*

3. İşləyən, iş görmək üçün olan, iş görən, təsərrüfatda istifadə olunan. *İşlək heyvanlar. İşlək at. – İşlək malı öyərlər; Tənbəlini söyərlər; Öküz cütə getməsə; Qaşqasına döyərlər.* (Holavar).

4. *tex.* İşləyən, hərəkət edən, ya hərəkət etdirici. *İşlək boru. İşlək çarx. – Buruğun ortasında qoyulmuş rotor firlanaraq, kvadrat işlək boru vasitəsilə quyudakı qazıma kəmərini də firladır və beləliklə, hərəkət baltaya keçirilir.* S.Quliyev. // Saz (maşın və s. haqqında).

**İŞLƏK**[2] *is. dan.* b a x **işdək**. [Leylək Ələmdar] *yırğalana-yırğalana Müqim bəy Cavanşirin həyətinə girəndə birdən-birə çar pristavını görüb, özünün bütün işləklərini xatırladı.* S.Rəhimov. [Anam:] *Qoymursan bu tramvay altında qalmışın işləklərini bildirəm.* Mir Cəlal.

**İŞLƏMƏ**[1] "İşləmək"dən *f.is.*

**İŞLƏMƏ**[2] *is.* 1. İynə və s. ilə parça üzərində işlənmiş bəzək, naxış. *Güləbətin işləmələr bəzi geyimlərin, araqçın, saatqabı, pul kisəsi, daraqqabı və başqa məişət şeylərinin üzərində görülür.* "Azərbaycan xalq sənəti". // Həkk edilmiş, qazılmış, oyulmuş naxış, şəbəkə və s. *Sola və sağa açılan qapıların yanında ləmə kimi divara qazılmış, dördkünclü işləmələr vardı.* M.İbrahimov. // Kağızdan kəsilmiş bəzək. *Qəfəsələr üstünə; Salmaq üçün kağızdan; İşləmələr qayırdı.* B.Vahabzadə.

2. B a x **işləməli**. *İşləmə dəsmal.*

**İŞLƏMƏK** *f.* 1. İş görmək, bir işlə məşğul olmaq, çalışmaq, əməyini tətbiq etmək. *Tarlada işləmək. Əkində işləmək. Evdə işləmək. Axşamlar işləmək. – O saat bilinirdi ki, sədr arabaçının vicdanla və hamıdan yaxşı işlədiyinə tamamilə arxayın idi.* M.Hüseyn. *Şərəfoğlu Muğanda iki dəfə uzun müddət yaşayıb işləmişdi.* M.İbrahimov. *İşçilər istiyə baxmadan od kimi işləyirdilər.* Mir Cəlal. // Bir yerdə xidmət etmək. *Məktəbdə işləmək. Zavodda işləmək. Harada işləyirsən?* – [Həsənağa:] *Baxım görüm nəyə ləyaqətləri var, bir əməlli qulluğa qoyum işləsinlər, sən də bir qədər istirahət elə.* Ə.Haqverdiyev. *Əziz Narıncın maarif şöbəsində işlədiyini bilirdi.* S.Rəhman. // *dan.* Bir vəzifə daşımaq, bir peşədə çalışmaq, ...vəzifəsini yerinə yetirmək. *Mexanik işləmək. Mühasib işləmək. İdarədə katib işləyir. – Bir gün Məşədibəy vaxtı ilə mühəndis işlədiyi Bayıl elektrik stansiyasından tanıdığı fəhlə dostu ilə küçədə təsadüfən qabaqlaşdı..* M.Hüseyn.

2. Çalışaraq yaratmaq, hazırlamaq, mükəmməlləşdirmək, yaxud tədqiq etmək, yaradıcı əməklə məşğul olmaq (çox vaxt "üzərində" sözü ilə). *Öz rolu üzərində işləmək. Dissertasiya üzərində işləmək. Yazıçı yeni əsər üzərində işləyir.* ☐ **Öz üzərində işləmək** – öz biliyini, səviyyəsini, təcrübəsini artırmaq üçün daim məşğul olmaq, çalışmaq. // Bir şeyi islah etmək üçün üzərində düşünmək. *Əsərin üzərində çox işləmək lazımdır.*

3. Müntəzəm surətdə öyrətməklə, yetişdirməklə, tərbiyələndirməklə məşğul olmaq. *Kadrlarla işləmək. Uşaqlarla işləməyi bacarmaq lazımdır.*

4. Hər hansı alət, cihaz, maşın və s. vasitəsilə iş görmək. *Maşınla işləmək. İynə ilə işləmək. Çəkiclə işləmək.*

5. Bədən üzvlərinin fəaliyyəti haqqında. *Ürəyi işləmək. Nəbzi zəif işləyir. Mədəsi yaxşı işləmir. – Məmməd kişinin beyni maşın dəyirmanı kimi işləməyə başladı.* S.Rəhman. *Sanki, Fərhadın ürəyi elə bu an işləməyə, onun vücudu bu dəqiqə hərəkət etməyə başladı.* Ə.Vəliyev.

6. Hərəkətdə olmaq, dayanmadan iş görmək (maşın və s. haqqında). *Maşın işləyir. Telefon işləyir. Saat düz işləyir.* // Müəyyən istiqamət üzrə müntəzəm gedib-gəlmək. *Bu küçədən avtobus işləyir.* // Saat haqqında. *Saat 2-yə işləyir. – Nəhayət, saat birə on beş dəqiqə işləmiş Səlimi gəldi.* M.İbrahimov. [Rəis:] *Daha bəsdir, – dedi, – qalanını səhər hesablarıq, saat birə işləyir.* İ.Əfəndiyev.

7. Hər hansı bir material və s. vasitəsilə hərəkət etmək, hərəkətdə olmaq. *Parovoz daş kömürlə işləyir. Motor benzinlə işləyir.*

8. Açıq olmaq, fəaliyyətdə olmaq, xidmət göstərmək. *Poçt bütün günü işləyir. Kitabxana həftənin bütün günlərində işləyir. Teatr bu gün işləmir.*

9. Prosesi davam etmək, uzanmaq (xəstəlik, yara və s. haqqında). *Əlinin yarası işləyir. – Yara işləyib sim eləmiş, iki ay onu ibadətdən qoymuşdu.* Mir Cəlal.

10. Həkk etmək, qazımaq, yaxud naxış vurmaq, bəzək vurmaq. *Qabın üstünü işləmək. Köynəyin yaxasını işləmək. – Xəncəri işlə, yolla; Üstün gümüşlə, yolla; Mənə beş alma göndər; Birini dişlə, yolla.* (Bayatı).

11. Bir şeyin içərisinə keçmək, dərinləşmək. *Güllə bədəninə xeyli işləyib.* // Təsir etmək, keçmək, girmək, yerimək (çox vaxt "iliyinə" sözü ilə). *Soyuq adamın iliklərinə işləyir. – Səhər ayazı hətta sağ adamın iliyinə işləyirdi.* M.Hüseyn. *İndi ruhuna dolan qorxu və təlaşla bərabər, qızın vücuduna soyuq işləyir, o titrəyir, lakin hələlik özünü saxlayırdı.* Ə.Məmmədxanlı. *Sabah ertənin soyuğu çılpaq insanların iliyinə qədər işləyirdi.* Ə.Vəliyev. // Girmək, nüfuz etmək. *Su torpağın dərinliklərinə işləmişdi.*

12. *məc.* Təsiri olmaq, hökmü çatmaq, nüfuzu çatmaq. *Sayalının kağız-baratsız, qolsuz, möhürsüz hökmü dəmir yolundan Kürün qırağına qədər işləyirdi.* Mir Cəlal.

13. Açılmaq, atılmaq. *Lakin çıxar-çıxmaz bir-birinin ardınca iki güllə işlədi.* T.Ş.Simurq.

14. *məc.* Təsvir etmək, izah etmək, göstərmək. *Yazıçı əsərdəki surətləri diqqətlə işləmişdir.*

15. Etmək, yol vermək, görmək. *İşlədiyi ağır cinayətlərin dəhşətli xofundan təntiyən Ələmdar toqqasını açdı.* S.Rəhimov. *Son zaman Rüstəm kişi oğlunun tora düşməsindən, pis bir günah işləməsindən qorxurdu.* M.İbrahimov.

16. İşlək olmaq, gediş-gəlişli olmaq. *Bu yollar işləməsin; Bəzirgan qışlamasın; Mən sevdim, sən apardın; Tanrı bağışlamasın.* (Bayatı).

17. Bir sıra isimlərlə yanaşı, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: ağzı işləmək, başı işləmək, fikri işləmək.

**İŞLƏMƏLİ** *sif.* İynə və s. ilə üzərinə bəzək, naxış vurulmuş naxışlı, bəzəkli. *İşləməli köynək. İşləməli dəsmal.* – [Sona xanımın] *tafta köynəyi, güləbətin işləməli başmağı, .. nəyi, nəyi yox idi?!* Qantəmir. *Yubiley günlərində deyirdim: Səməd, döşü işləməli, qolu naxışlı; Təzə köynəyini geyəsən gərək!* O.Sarıvəlli. *Qızıl işləməli kuzələr dolduruldu.* İ.Əfəndiyev.

**İŞLƏNİLMƏ** "İşlənilmək"dən *f.is.*

**İŞLƏNİLMƏK** b a x **işlənmək**.

**İŞLƏNMƏ** "İşlənmək"dən *f.is.*

**İŞLƏNMƏK** *məch.* 1. Sərf edilmək, istifadə edilmək, işlədilib qurtarmaq. *Materialların hamısı işləndi.*

2. Emal olunmaq, düzəldilmək, hazırlanıb lazımi şəklə salınmaq.

3. Danışıqda, yazıda tətbiq edilmək, istifadə edilmək. *Bu söz köhnəlmişdir, indi işlənmir. – Taqımdan ancaq bir-iki nəfəri sözün belə ikibaşlı işləndiyini anlayıb güldü.* Ə.Əbülhəsən.

4. Qazılmaq, həkk edilmək, yaxud bəzək vurulmaq; naxışlanmaq. *Divarda müxtəlif əfsanə və macəralar işlənmişdi.* S.Rəhimov.

5. Üzərində iş aparılmaq, üzərində işlənib təkmilləşdirilmək, yaxşılaşdırılmaq. *Əsər üzərində bir qədər işlənməyi tələb edir.*

**İŞLƏNMİŞ** *f.sif.* 1. Çox istifadə edilmiş, çox işlənməkdən köhnəlmiş; nimdaş. *İşlən-*

*miş palaz. İşlənmiş qab. – Aylar ilə işlənmiş mahud külahı dala tərəf sürüşmüşdü.* A.Divanbəyoğlu. *Pərşan əlinə keçən işlənmiş süfrəni stolun üstünə salanda Rüstəm kişi acıqlandı..* M.İbrahimov.

2. Üzərində naxış qazılmış, həkk edilmiş, yaxud naxışlanmış, bəzək vurulmuş. *İşlənmiş dəsmal. İşlənmiş kəmər. Zərlə işlənmiş cild.* – [Çopo:] *Altun dəstəkli, incə tikişlərlə işlənmiş qapıdan içəri girdim.* Çəmənzəminli.

3. Təkmilləşdirilmiş, mükəmməlləşdirilmiş, işlənib qaydaya salınmış, düzəldilmiş. *Üzərində işlənmiş əsər.* // Üzərində iş aparılmış, tədqiq edilmiş, öyrənilmiş, hərtərəfli düşünülmüş. *Yaxşı işlənmiş mövzu.*

**İŞLƏRBAŞI** *sif.* Əsas səbəbkar, əsas günahkar, əsas işi görən. [Mütəəllimə:] *Dədəm də həmişə nənəmi döyür ki, işlərbaşı sənsən.* Çəmənzəminli.

**İŞLƏTDİRİLMƏ** "İşlətdirilmək"dən *f.is.*

**İŞLƏTDİRİLMƏK** "İşlətdirmək"dən *məch.*

**İŞLƏTDİRMƏ** "İşlətdirmək"dən *f.is.*

**İŞLƏTDİRMƏK** *icb.* İşləməyə məcbur etmək.

**İŞLƏTMƏ** 1. "İşlətmək"dən *f.is.* [Murad] *ömrünün bir qismini Xəzər dənizində mexaniklikdə keçirdiyi üçün motor işlətməni bilirdi.* S.Hüseyn.

2. *is.* Mədəni, bağırsaqları təmizləmək üçün işlədilən, istifadə edilən dərman. *Xəstəyə işlətmə vermək.* // Sif. mənasında. *İşlətmə yağı. İşlətmə dərmanı. – Bitki mənşəli işlətmə maddəsinə malik həblər üçün tibbi sabun yaxşı formavericidir.* "Dərman növləri".

**İŞLƏTMƏK** *f.* 1. İş gördürmək, işlə məşğul etmək, iş görməyə məcbur etmək; çalışdırmaq. *Fəhlə işlətmək. Uşağı işlətmək. Qızı uşaqlıqdan işlətmək.*

2. Bir şey üçün istifadə etmək; faydalanmaq. *Ən uşaqlıqdan möhnətə adət etmiş Məşədi Əsgər gəmiçilik işinə mahir olduqda özü üçün bir barkas alıb işlətməyə şüru etdi.* S.M.Qənizadə. *Gülsənəm arvad təknə əvəzinə işlətdiyi alümin ləyəni stulla bərabər yerindən götürüb, .. qız əhvalatını açıb danışdı.* M.Hüseyn. *Fərmanın qoçaqlığı orasındadır ki, o, mürəkkəb maşını işlətməyi artıq mənimsəyibdir.* Ə.Sadıq.

3. Tətbiq etmək, işə salmaq. *Siyasət işlətmək. Fənd işlətmək. Hiylə işlətmək. – Koroğlu qayıtmaz, tufan salmasa; Cida işlətməsə, qılınc çalmasa.* "Koroğlu". *Molla Qasım anladı ki, .. hər nə kələyi varsa, işlədə biləcəkdir.* S.S.Axundov. *Böyük yazıçı vəfat etdiyi günə qədər qələmini işlətdi.* M.İbrahimov.

4. Sərf etmək. *Pulu qənaətlə işlətmək. – Cəm oluruq bir məclisə yüz nəfər; İşlədirik neçə batman çay, şəkər.* Ə.Nəzmi. // İçmək, qəbul etmək, yaxud içmək və ya yemək kimi istifadə etmək. *Sirkəni artıq işlədənin bədəni zəif olur.* H.Zərdabi. [Professor:] *Bu dərmanları vaxtında işlət..* Qantəmir.

5. Danışıqda, yazıda tətbiq etmək, istifadə etmək. *Qəliz ibarələr işlətmək. – Hələ .. ruslar, polyaklar və qeyrilər bizə görə öz dillərini və yazılarını çox işlədirlər..* C.Məmmədquluzadə. [Səmirə:] *Orta məktəbdə oxuyarkən bizim hamımızın işlətdiyi bu dəbdə bəzi ifadələr indi məndə parodiya təsiri buraxırdı.* M.Hüseyn.

6. Adətən "qarnını" sözü ilə – ifraz prosesini qaydaya salmaq, yaxud əksinə, ayaqyoluna salmaq.

**İŞLƏTMƏLİ** *sif.* İşlətmək, sərf etmək, ehtiyacı rəf etmək üçün olan; işlətmək üçün ayrılmış (saxlanmış, təyin edilmiş).

**İŞLİ** *sif.* 1. İşi olan, işlə təmin olunmuş.

2. *məc.* Ürəyində kinli sözü, mətləbi olan. *O, işli adama oxşayırdı.*

**İŞLİ-GÜCLÜ** *sif.* Əlindən hər iş gələn, bacarıqlı, zəhməti, işi sevən. *O, işli-güclü qızdır.*

**İŞLİ-PEŞƏLİ** bax **işli-güclü**.

**İŞMƏK** bax **eşmək**.

**İŞMƏKLİ** bax **eşməkli**. [Xırdaxanım:] *..Mən də sənə borclu oluram bir dəst şaldan libas ibrə işməkli..* N.Vəzirov.

**İŞ-PEŞƏ** *is.* Sənət, peşə, iş-güc. *Ögey ana o gündən Fatmaya gündə bir küllü kömbə verib, darağnan yun daramağı ona iş-peşə elədi.* (Nağıl). *Gecə-gündüz işin-peşən yoxmudur? Çəkilməzsən bir dəqiqə arxamdan.* Ə.Cavad.

**İŞRAQİLİK** [*ər.* işraqiyyə – şəfəq, parıltı] Orta əsrlərdə müsəlman ölkələrində yayılmış fəlsəfi cərəyan. *İşraqilik fəlsəfəsi. İşraqiliyə görə kölgələr işıqlarla yanaşı daima mövcuddur.*

**İŞRƏT** *is.* Kef, eyş-işrət; içki içmə. *Əyyami-zimistan keçdi, sevdiyim; Dur, seyr eylə, işrət baharıdır bu!..* Q.Zakir. *Biz bir neçə kamança, tar tapmışıq; Burda bir işrət məclisi qurmuşuq.* A.Səhhət. *Bu gecə oğlu Mürsəlin toy məsləhəti gecəsi olmaqdan artıq, onun üçün kef və işrət məclisi idi.* A.Şaiq. ☐ **İşrət etmək (eləmək)** – əylənmək, kef çəkmək. *Xeyr olsun, hər kəs yığnağındadır; Onlar ilən zövqü işrət eylərsən.* M.V.Vidadi. *Hanı o mah ilə mən işrət etdiyim gecələr.* S.Ə.Şirvani. *Bir gecə Otellonun bədxahları qızın atasını yuxudan oyadıb, ona xəbər verirlər ki, sənin qızın ismət və həyanı unudub, qara ərəb ilə işrət etməkdədir.* F.Köçərli.

**İŞRƏTLİ** *sif.* Kef büsatı qurulmuş, kef üçün düzəldilmiş. [Lətif şah:] *Dost bağında, gəldim, lələ! İşrətli divanı gördüm.* “Lətif şah”.

**İŞSEVƏN** *sif.* İşləməyi, çalışmağı sevən; işcil. *İşsevən adam.*

**İŞSİZ** *sif.* 1. Daimi işi, iş yeri və maaşı olmayan. *İşsiz fəhlələrin nümayişi.* – [Mehriban ərinin] *işsiz* (z.) *qaldığı günlərində aclığını, çılpaqlığını açıb söyləmədiyi kimi bir çox qış gecələrini yanacaqsız keçirmiş, şikayət etməmişdi.* S.Hüseyn. // İs. mənasında (adətən cəm şəklində). *İşsizlər ordusu.*

2. Bikar, avara, veyl, heç bir işlə məşğul olmayan. *Küçələr və körpünün qarşısı işsiz camaatla dolmuşdu.* M.S.Ordubadi. // *Zərf mənasında.* Heç bir işlə məşğul olmadan, avara-avara, veyl-veyl. *İşsiz gəzmək. İşsiz küçələri dolaşmaq.*

3. *zərf* Hərəkətsiz, istifadəsiz, boş-bekar. *..Kitayda yapon malını baykot eləyib, karxanalarını işsiz qoyublar.* C.Məmmədquluzadə.

**İŞSİZ-GÜCSÜZ** b a x **işsiz** 2-ci mənada.

**İŞSİZLİK** *is.* 1. Bir yerdə işsizlərin, daimi maaşı olmayan adamların mövcud olduğu hal. *Kütləvi işsizlik halları. İşsizliyin xroniki hal alması.*

2. İşsiz adamın hal və vəziyyəti. *Bir yandan işsizlik, parasızlıq, .. bir yandan da sənət eşqi, təbin coşqunluğu və qanın oyanması Baxışoğlu Həsəni rahat buraxmayıb, ruhuna əziyyət verirdi.* B.Talıblı.

3. Bikarlıq, görüləcək işin olmaması; məşğuliyyətsizlik. *İşsizlikdən hər gün sahil boyu ilə bir qədər yol gedər və ya da ormana girib gəzməklə, özümü əyləndirərdim.* S.Hüseyn. *Student qapının arasından: – Xırda hekayələr olsa, çox məmnun olaram, – dedi, – yoxsa işsizlikdən darıxıram.* Çəmənzəminli.

**İŞSİZ-PEŞƏSİZ** b a x **işsiz-gücsüz**. [Murad] *Bakıda olurkən işsiz-peşəsiz bulunmayırdı.* S.Hüseyn.

**İŞTAH(A)** *is.* [*ər.*] 1. Yemək istəmə, yeməyə meyil, yemək arzusu. *Təmiz hava adamın iştahasını artırır. – İştaha diş altındadır.* (Məsəl). *..Yazırsan ki, iştaham azalıb, belə ki, sübh vaxtı bozbaş yeyəndə, axşam azanı deyiləndə kabab yeyirəm..* C.Məmmədquluzadə. [Qurban:] *Neyləyim, Allah plovu bir adama verir, iştahı bir ayrısına.* Ə.Haqverdiyev.

2. *məc.* Arzu, istək, həvəs. *Müftə pulları alıb cibinə dolduranda* [onun] *iştahası daha da artdı.* “Kirpi”. ☐ **İştah(a) ilə, iştahla** – 1) həvəslə, ləzzətlə, acgözlüklə. *İştahla yemək.* – [Oruc] *tütək çalırkən qoyunlar iştah ilə ot otlar, arabir qulaqlarını qırparaq o səsi dinlərdi.* A.Şaiq. *Nəcəf iştaha ilə yeyir, xalasının ona etdiyi yaxşılıqlardan uzun-uzadı danışırdı.* Q.İlkin; 2) *məc.* arzulu, həvəsli, həsrətkeş. *Pulsuz, lakin iştahalı tamaşaçı sovuşmaq istəmir.* Mir Cəlal.

◊ **İştahası açılmaq** – yemək arzusu daha da artmaq, daha da iştahalanmaq, yemək istəmək. [Bərbərzadə:] *Həmişə bu yoldaşla söhbət eyləyəndən sonra, mənim iştaham açılır.* S.Rəhimov. **İştahası böyük olmaq** – çox böyük şeylər ummaq, imkanı, ləyaqəti xaricində olan şeylərin arzusunda olmaq. [Teymur:] *Yox, aşna, iştahan çox böyükdür. İnanmıram, bu qədər verə.* “M.N.lətif.”. **İştahası çəkmək** – ürəyi istəmək, meyli olmaq. *İslam gülə-gülə yavaş səslə* [Telliyə] deyirdi: – *Ay qız, gic olma!.. Çox vaxt adam yağlı plovdan çiyrənər, iştahası soğan-çörək yemək çəkər.* S.Hüseyn. **İştahası küsmək (bağlanmaq, pozulmaq, tutulmaq)** – bu və ya başqa bir səbəb üzündən yemək istəməmək, yeməkdən qalmaq, ürəyi heç bir şey istəməmək. *Qarabaş bildi ki, Əhmədin fikri Pəri Soltanı narahat eləyib, iştahı bağlanıb.* (Nağıl). [Qurban:] *Di yaxşı, gəl götür, iştahım tutulub, yeyə bilmirəm.* Ə.Haqverdiyev.

**İŞTAH(A)AÇAN** *sif.* İştaha gətirən, iştaha artıran, yemək həvəsi oyadan. *İştahaaçan dərman. İştahaaçan yeməklər. – Mübaşir Məmməd israr etdi: – Abcosuz o əti yemək haramdır. ..Gərək iştahaaçan, qızışdıran bir şey olsun ki, yeyə biləsən..* M.İbrahimov. [Sultan Səmədə:] *Buralarda ol, gedək evə, sənin üçün sarımsaqlı, iştahaaçan şey bişirtdirim.* İ.Hüseynov.

**İŞTAH(A)GƏTİRƏN, İŞTAH(A)GƏTİRİCİ** bax **iştah(a)açan**.

**İŞTAH(A)LANDIRMA** "İştah(a)landırmaq"dan *f.is.*

**İŞTAH(A)LANDIRMAQ** *f.* İştaha gətirmək, iştaha oyatmaq, yemək həvəsini artırmaq. *Xörəyin ətri adamı iştahlandırırdı. – Təzə çörəyin ətri həyətdə oturanları iştahlandırırdı.* S.Şamilov.

**İŞTAH(A)LANMA** "İştah(a)lanmaq"dan *f.is.*

**İŞTAH(A)LANMAQ** *f.* Yeməyə həvəs oyanmaq, iştahaya gəlmək.

**İŞTAH(A)LI** *sif.* Yaxşı iştahası olan, yeməyi iştaha ilə, həvəslə yeyən. *İştahalı adam.*

**İŞTAH(A)SIZ** *sif.* İştahası olmayan, qarnı tox olmadığı halda yeməyə istəyi olmayan. *Telli balaca qızdır; Yeməyə iştahsızdır.* M.Dilbazi. // *zərf* Yemək istəmədən, yeməyə istəyi olmadığı halda; meyilsiz, həvəssiz, könülsüz. *Xörəyi iştahasız yemək. – Mirzə iştahasız nahar yeyib yatmaq istədi, hərçi çalışdı yuxusu gəlmədi.* Ə.Haqverdiyev.

**İŞTAH(A)SIZLIQ** *is.* İştaha olmaması, yemək istəməmə, yeməyə həvəs olmadığı hal.

**İŞTƏ** *əd.* [*türk.*] Budur, bax. *Ey ezizidilü can, ey fərəhi-qəlbi-məlul! Edərəm, iştə, bu təklifini şükranla qəbul!* A.Səhhət. *Görürsünüz, fövqəladə hadisə, iştə, bu idi..* S.Hüseyn.

**İŞTİBAH** *is.* [*ər.*] 1. Şübhə, şəkk; şübhə etmə, şəkk etmə. *Sən o deyilmidin, dedin: dumdur ümidgahımız? Mən demədimmi, var buna dumduru iştibahımız?* M.Ə.Sabir. ☐ **İştibah doğurmaq** – şübhə doğurmaq. **İştibah etmək** – şübhələnmək, şübhəyə düşmək. **İştibaha salmaq** – şübhəyə salmaq, şübhə oyandırmaq; şəkləndirmək, şübhələndirmək. *O ki qaldı Dilşadın məsələsinə, zənnimcə, Fəxrəddini iştibaha salmamaq üçün Dilşadı həbsdən azad etməliyik.* M.S.Ordubadi.

2. **İştibahla** şəklində *zərf* – şübhə ilə. [Oğlan] *qəribə bir iştibahla uzunburun, sallaqbığ, qırışsifət, uzunqılça adama nəzər saldı..* S.Rəhimov.

**İŞTİRAK** *is.* [*ər.*] Bir işdə başqaları ilə birlikdə fəaliyyət göstərmə, iş görmə. [Qadın:] *Mənim bu səyahətdə iştirakım möhtərəm ağamızı məmnun buraxdımı?* M.S.Ordubadi. *Mollanəsrəddinçilər xalq kütlələrinin iştirakı olmadan milli intibah təsəvvür etmirdilər.* M.İbrahimov. // Şərik olma, ortaq olma; şəriklik, ortaqlıq (şəriklik) etmə, bir şeydə payı olma. ☐ **İştirak etmək** – bir işin icrasında başqaları ilə birlikdə fəaliyyət göstərmək, bir işin icraçısı olmaq. *Məhkəmə açıq olacaq və bütün hərbi xidmətçilər iştirak edəcəklər.* H.Nəzərli. *Şəhərdə ilk dəfə olaraq bayramda təyyarə modelçiləri də iştirak edirdilər.* M.Rzaquluzadə. // Bir şeydə payı olmaq, şərik olmaq, ortaq olmaq. *Səhmdarlar cəmiyyətində iştirak etmək.*

**İŞTİRAKÇI** *is.* Bir işdə iştirak edən adam. *Dərnək iştirakçısı. Müşavirə iştirakçıları. Qurultay iştirakçıları. – Çalğıçılar xüsusi həvəs göstərir, o biri iştirakçılar əl çalırdı.* M.İbrahimov. *Böyük bir yarımdairə halında toplaşmış iştirakçı və tamaşaçılar kütləsinin mərkəzində masa qoyulmuşdu.* M.Rzaquluzadə.

**İŞTİRAKÇILIQ** *is. hüq.* İştirak etmə. // Ortaqlıq, şəriklik.

**İŞTİYAQ** *is.* [*ər.*] *klas.* Şövqündə olma, həsrətində olma, həsrətini çəkmə; şövq, həvəs, şiddətli arzu, həsrət. *Saraldı mehrtək yüzüm cəmalın iştiyaqindən.* Kişvəri. *Eylərəm hər yerdə sənin sorağın; Gündən-günə artar bil iştiyaqın..* Qurbani. *Seyr edin iştiyaqü həsrət ilə; Bu gözəl lövhə sonra düşməz ələ.* H.Cavid. *Bu dəfə Sitarə Mənsurun məhəbbətinə bənd olub, iştiyaqında gəzir idi.* C.Cabbarlı. ☐ **İştiyaq(ını) çəkmək** – həsrətini çəkmək, həsrətində olmaq. *Nə müddətdi iştiyaqın çəkirdim; Şükür həqqə, pərizada gedirəm..* Q.Zakir. *Didarına mən müştaqəm, mən müştaq; Vəqtü bivəqt çəkməkdəyəm iştiyaq.* Aşıq Hüseyn. **İştiyaqa düşmək** – şövqə düşmək, həvəsə düşmək.

*Aşiqləri iştiyaqə düşdü; Hər kəs ayılıb qabağə düşdü.* M.Ə.Sabir. [Ziba:] *Axır o izdihamlı şəhərdən çıxandan, atamın arxasınca buraya gələndən sonra niyə mən bu fikrə, bu iştiyaqə düşdüm?* S.Rəhimov.

**İŞTÜX, İŞTÜK** *is. məh.* Ağız sözü, uydurma, düzəltmə, yalan. *Bunlar hamısı iştükdür. – Kim deyir ki, o, bu gün Danabaş kəndində deyil, xeyr, bunlar hamısı iştüx sözdü.* C.Məmmədquluzadə.

**İŞVƏ** *is.* [*ər.*] Naz, qəmzə, işvə, cilvə; qəmzəli baxış. *Dağ başından yar aşar; Yar dolanar, yar aşar; İşvə, qəmzə, bir də naz; Tək bir sənə yaraşar.* (Bayatı). *Belə işvə, belə qəmzə, belə naz; Belə qamət, belə gərdən olurmu?* Q.Zakir. *Nazı çox, qəmzəsi bol, kibri də var dilbərimin; Baxmamaq işvəsidir aşiqə taci-sərimin.* Ə.Nəzmi. ☐ **İşvə satmaq** – naz-qəmzə eləmək. *Maralın, ceyranın min işvə satır; Su göndər bu yerdə yanana, dağlar!* S.Vurğun. *Al-yaşıl geyinib seyrana çıxmış; İşvə satır güllü yaza gözəllər.* Aşıq Ağalar.

**İŞVƏBAZ** *sif.* [*ər.* işvə və *fars.* ...baz] İşvə edən, işvəkar, nazlı.

**İŞVƏBAZLIQ** *is.* İşvə, naz-qəmzə etmə xasiyyəti.

**İŞVƏKAR** *sif.* [*ər.* işvə və *fars.* ...kar] Öz qəmzəli baxışları ilə kişiləri məftun edən; işvəli, qəmzəli. [Zeynəb xanım] *Alış bəyi görüncə qaşlarını qaldırdı, fitnəli gözlərini süzdü və işvəkar bir səslə qulluqçuya dedi: – Ovçuluq gözəl şeydir.* Çəmənzəminli. *Müəyyən bir məqsədlə kişilərə yanaşan işvəkar qadın ən möhkəm iradəli şəxslərə belə sevginin zəhrini aşılaya bilər.* M.S.Ordubadi. *Şux və işvəkar ərəb qızları gələr və xaqanla əylənərlər.* H.Cavid. // *İs. mənasında.* Dilbər. [Arif İblisə:] *Bir afətə, bir nigarə uydum; Bir qəmzəli işvəkarə uydum.* H.Cavid. *Bütün ətrafə min bəzək saçılır; Durma gəl, nazlım, işvəkarım, gəl!* S.Rüstəm.

**İŞVƏKARANƏ** *zərf* [*ər.* işvə və *fars.* karanə] İşvə ilə, nazla, naz-qəmzə ilə. *İşvəkaranə yerimək.*

**İŞVƏKARLIQ** *is.* İşvə satma, naz satma; naz-qəmzə. *İşvəkarlıq etmək.*

**İŞVƏLİ** *sif.* Nazlı, qəmzəli, cilvəli, şux, dilbər. *İşvəli qız. İşvəli gəlin. İşvəli təbəssüm. – Ah sevgili nigar, sən qal indi! Ey işvəli yar, sən qal indi!* Xətayi. *Dolanım başına, ey nazlıca yarım, bəri bax; İşvəli, qəmzəli, çəm-xəmli nigarım, bəri bax.* S.Ə.Şirvani. *Əminə iyirmi yaşında idi, gözləri anasınınkı kimi sakit və kədərli deyildi, oynaq və işvəli idi.* S.Rəhman.

**İT** *is.* 1. Canavar, tülkü kimi heyvanların mənsub olduğu yırtıcı məməli heyvanların xüsusi fəsiləsinə mənsub ev heyvanı. *Çoban iti. Həyət iti. Ov iti. – İt, qulağını kəsəndən qorxar.* (Məsəl). *Hərdən it hürüşməsi, səs-küy eşidilməsəydi, yarım kilometrlikdə böyük bir kəndin yerləşdiyini bilmək olmazdı.* İ.Hüseynov.

2. *məc.* Bədxasiyyət, acıdil, davakar, söyüşkən, rəftarsız adam haqqında (çox zaman “kimi” qoşması ilə işlənir). *İt kimi rəftar edir.* // Söyüş kimi işlənir. [Sultan bəy:] *..İtin birisi qapıma gəlib qızımı özünə bənd eləyir, belə də binamusluq olar?!* Ü.Hacıbəyov.

◊ **İt də getdi, ip də** *dan.* – hər şey əlindən çıxdı, hər şeydən əli üzüldü, bütün ümidlər boşa çıxdı. **İt dəftərində adı yoxdur** *dan.* – çox hörmətsiz, sayılmaz, avara, işsiz-gücsüz adam haqqında. [Aslan:] [Oqtayın] *it dəftərində adı yoxdur.* C.Cabbarlı. **İt günü çəkmək** *dan.* – çox pis, çox ağır həyat keçirmək; əziyyət, məhrumiyyət içində yaşamaq. **İt kökündə** – b a x **it günündə**. **İt günündə, it diriliyində** *dan.* – 1) çox pis halda, çox pis vəziyyətdə, çirk, natəmiz. *Bir para uşaqlar olur ki, əsgilər, kirlər içində ortalıqlarda fırlanırlar. İt günündə, it diriliyində yaşayırlar.* “Məktəb”; 2) yorulmuş, incimiş, əldən düşmüş. *İt günündə gəlib çıxdılar.* **İt ilində** – çoxdan, çox uzaq keçmişdə, yaddan çıxmış bir vaxtda. *İt ilində olan iş.* – [Osman:] *Bir də, İsgəndərin bizə nə dəxli var, ey? İt ilində babası körpüdən keçəndə, mənim babamın böyrünə dəyib.* M.Hüseyn. **İt yiyəsini tanımır** *dan.* – həddindən artıq adam, basabas, qələbəlik olan yer haqqında. *Pristavın həyətində it yiyəsini tanımırdı, səsdən, qilü-qaldan qulaq tutulurdu.* C.Məmmədquluzadə. **İtdən alıb itə vermək** *dan.* – b a x **itdən əskik eləmək**. *Əfrasiyab xan dişinin dibindən gələni Lələ-*

*şə dedi, onu itdən alıb itə verdi..* S.Rəhimov. **İtdən biabır etmək** *dan.* – bax **itdən əskik etmək**. [Səkinə xanım:] *..Özüm onu çağırıb beş yüz söyüş üzünə qarşı deyərəm. Onu itdən biabır edərəm.* M.F.Axundzadə. **İtdən əskik etmək** *dan.* – bax **itin sözünü demək**. **İtə dönmək** *dan.* – bərk hirslənmək, qeyzlənmək, hamını acılamaq. *Vəznəli kişi .. sonra, yenə itə dönmüşdü.* Mir Cəlal. **İtin dilini bilir** *zar.* – bic, çoxbilmiş adam haqqında. *İtin dilini bilir, cəhənnəmin yolunu.* (Ata. sözü). **İtin dişi, motalın dərisi** *dan.* – mənə dəxli yoxdur, mənə nə var, özləri bilər. [Allahqulu:] *İtin dişi, motalın dərisi! O Sirat, o da düşmənləri!* Ə.Əbülhəsən. **İtin sözünü demək** *dan.* – təhqir edərcəsinə ağır, pis sözlər demək, tamamilə abırdan salmaq. *O görürdü ki, qabağında heç kəsin cınqır çəkməyə cəsarət etmədiyi kişiyə itin sözün deyirlər, başını qaldırıb cavab da vermir..* Mir Cəlal. **İtinə tök** *dan.* – həddindən çox, lap çox, bol. [Molla Nəsrəddin:] *Bizim kənddə elə saraylardan o qədər var ki, itinə tök.* "M.N.lətif.". *A kişi, iş adama qalsa, sənə o qədər adam verim ki, lap itinə tök.* C.Cabbarlı. **İtlə çıxarmaq (qovmaq)** – təhqir edib, söyüb, abır verib qovmaq. [Nəcəfbəy Süleyman bəyə:] *..Mənim qapıma ayağın düşər, səni it ilən çıxardaram.* Ə.Haqverdiyev. **İtlə pişik kimi (dolanmaq)** – bir-biri ilə yola getməyən, bir-biri ilə daim dava edən adamlar haqqında. *Ağzında Ayrım qızı deyirsən, necə dolanacağıq, it ilə pişik kimi.* A.Şaiq. *Çimnaz arvad demişkən, bu Nazlı ilə Veys itlə pişik kimi dolanmaqlarına baxmayaraq, bu qəsəbədə bir-birini ən çox istəyən bacı-qardaşdı.* Ə.Əbülhəsən. **Başına it oyunu açmaq (gətirmək)** – bax **baş**. **...kimin iti tutub** – ...kim sancıb, ...kim toxunub, ...kim xətrinə dəyib. [Lələşov Balacaxanıma:] *Mən bilmirəm yenə də bu gün səni kimin iti tutubdur, qız!* S.Rəhimov. **...nə iti (itim) azıb?** *dan.* – ...nə işi (işim) var, ...nəyinə (nəyimə) lazımdır, ...nəyinə (nəyimə) gərək. [Şəhrəbanı xanım:] *Firəngdə onun nə alıb-verəcəyi var? Parijdə onun nə iti azıbdır?* M.F.Axundzadə. [Məsmə:] *Deməzlərmi, ay filan-filan olmuşun qızı, bir tikə uşağın şəhərlərdə, hacıların qapısında nə iti azmışdı?* Mir Cəlal.

**İTAƏT** *is.* [*ər.*] 1. Tabe olma, boyun əymə, sözə qulaq asma, göstərişə əməl etmə; tabelik. *Ata-anaya itaət. Böyüyə itaət.* – [Qaplan:] *Əmrinə itaət bir vəzifədir; Verdiyin hər fərman bizə töhfədir.* A.Şaiq. *Çay üstündə qazı həmçinin vəz edib böyüyün kiçiyə məhəbbəti, kiçiyin böyüyə itaəti barəsində uzun bir söhbət elədi.* Ə.Haqverdiyev. *Bu səsdə itaət tələb edən bir güc var idi.* H.Seyidbəyli. ☐ **İtaət etmək (eləmək, qılmaq)** – tabe olmaq, əməl etmək, sözə qulaq asmaq. *Zeynəb oğlundan .. razıdır. Ondan ötəri ki, Vəliqulu o itaəti ki anasına eləyir, bəlkə atasına eləməzdi.* C.Məmmədquluzadə. [Soltan bəy:] *Qızım, inad olma, atan nə deyir sən də ona itaət elə.* Ü.Hacıbəyov. [Şeyx Sənan:] *Get, babandır, Xumar, itaət qıl; Hər nə əmr etsə, dinlə, hörmət qıl!* H.Cavid. **İtaətdə durmamaq** – tabe olmamaq, sözə qulaq asmamaq, özbaşına hərəkət etmək. **İtaətdə olmaq** – birinin tabeliyində, əmrində, hakimiyyəti altında olmaq. **İtaətdən çıxmaq** – itaətsizlik etmək, tabe olmamaq; sözə, əmrə, göstərişə əməl etməmək, qulaq asmamaq, başlı-başına hərəkət etmək. [Hacı Murad:] *..Qız mənim itaətimdən çıxa bilməz.* S.S.Axundov. *İtaətdən çıxan əsgər; Alar ölüm cəzasını.* R.Rza.

2. **İtaətlə** şəklində *zərf* – müti bir surətdə, itaət edərək; müticəsinə, ehtiramla. *Girdman adı gələndə, hamı hörmətlə və itaətlə baş əydi.* M.Hüseyn. *Soltanı qarabaşlar itaətlə dinlədi.* M.Rahim.

**İTAƏTKAR** *sif.* [*ər.* itaət və *fars.* ...kar] bax **itaətli**. *Şərif ki hər zaman ..* [Molla Xəlilin] *müti və itaətkar bir müridi idi, bütün bayır işlərini ona gördürərdi.* S.Hüseyn. *..Qaraqaşlı Davudun səliqəli, itaətkar, həvəsli işi ustanın xoşuna gəlirdi.* Mir Cəlal.

**İTAƏTKARCASINA** *zərf* [*ər.* itaət və *fars.* karanə] İtaətlə, müticəsinə.

**İTAƏTKARLIQ** *is.* İtaət etmə, tabe olma; hər əmrə, sözə, göstərişə sözsüz əməl etmə; mütilik, ehtiram. [Nuriyyə:] *Mən* [Muradın] *dəvətini qeyri-şüuri bir itaətkarlıqla* (z.) *qəbul etdim.* İ.Əfəndiyev.

**İTAƏTLİ** *sif.* İtaətdən çıxmayan, tabe olan, itaət edən; müti, intizamlı. [İblis:] *Heç*

*maraq etmə, əmin ol, o mənim ən itaətli qulumdur daim.* H.Cavid.

**İTAƏTLİLİK** b a x **itaətkarlıq**.

**İTAƏTSİZ** *sif.* İtaət etməyən, tabe olmaq istəməyən, sözə qulaq asmayan; dikbaş, intizamsız. *İtaətsiz uşaq.*

**İTAƏTSİZLİK** *is.* İtaət etməmə, boyun əyməmə, tabe olmama, sözə qulaq asmama; hörmətsizlik, intizamsızlıq. *Qızının belə itaətsizliyi İmamverdiyə artıq dərəcədə təsir etmişdi.* S.S.Axundov. *Min ilin əzilmiş rəncbəri sanki qəbirdən qalxıb mülkədarla vuruşur, əlinə götürdüyü yabanı, odlu silahı yerə qoymaq istəmir, itaətsizlik hər səmti bürüyür.* S.Rəhimov. □ **İtaətsizlik etmək (göstərmək)** – itaət etməmək, tabe olmamaq, sözə qulaq asmamaq, üzə durmaq, hörmətsizlik göstərmək. *Hələ arvadı Nigar açıqdan-açığa ona itaətsizlik edir, özünü yaxşı aparmayırdı.* S.Hüseyn.

**İTALİYALI** b a x **italyan**.

**İTALYAN** *is.* İtaliyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *İtalyan musiqisi. İtalyan operası. İtalyan dili Roma imperiyasının süqutundan sonra, latın xalq dili zəminində inkişaf etmişdir.*

**İTALYANCA** *sif.* və *zərf* İtalyan dilində. *İtalyanca-rusca lüğət. İtalyanca danışmaq. İtalyanca söz sırası sərbəstdir.* // *is.* İtalyan dili. *İtalyancanın başlıca fonetik və morfoloji xüsusiyyəti, əsasən, saitlə bitməsidir.*

**İTALYANÇILIQ** *is. köhn.* Musiqi əsərlərində, əksəriyyətlə operada italyan musiqisi üsullarının tətbiqi.

**İTARISI** *is. zool.* Yuvasını yerdəki deşiklərdə quran bozaçalar rəngli arı növü.

**İTBALIĞI** *is. zool.* Uzunsov başlı, əti yeyilməyən balıq növü.

**İT-BAT: it-bat düşmək** – itmək, yoxa çıxmaq, yox olmaq. **İt-bat eləmək** – yox etmək, aradan götürmək, məhv etmək. *Qarı qollarını çırmalayıb, Məlik vəzirin arvadını doğuzdurdu, gördü ki, bu bir oğlan doğdu ki, eynən Yusifi-Kənan. İstədi uşağı it-bat eləyə, baxıb gördü ki, adam çoxdu..* (Nağıl). **İt-bat olmaq** – yox olmaq, yoxa çıxmaq, aradan qalxmaq, məhv olmaq.

**İTBAZ** *is.* İt saxlamağı, itlə məşğul olmağı sevən adam. [Koxa:] *Səlim bəy itbazdır, tazıları var; Hər səhər onları hey öpüb yalar.* S.Rüstəm. [Məktubunda] *yazırsan ki, qəsəbənizin əhalisi xoruzbazların, qoçbazların və itbazların əlindən cana-bezara gəlmişdir.* "Kirpi".

**İTBAZLIQ** *is.* İt saxlama, itlə məşğul olma. *Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini qoçbazlıq, bildirçinbazlıq, itbazlıq və bu kimi işlərə verərdi.* H.Sarabski.

**İTBOĞAN** *is. bot.* b a x **novruzgülü**. *İtboğanın bəzi növləri dekorativ bitki kimi becərilir.*

**İTBURNU** *is. bot.* Qızılgül fəsiləsindən tikanlı kol bitki və onun qırmızı meyvəsi. *İtburnu kolu. İtburnu gülü. – İtburnu – qışda yarpağı tökülən, iki metrə qədər hündürlükdə, tikanlı koldur. May ayında çiçəklənir, meyvəsi vitaminlə zəngindir, sentyabrda yetişir.* H.Qədirov.

**İTÇİ** *is.* İt saxlayan, it yetişdirməklə məşğul olan adam.

**İTÇİLİK** *is.* İt saxlamaqla, it yetişdirməklə məşğul olma.

**İTDAMI** *is.* 1. İt saxlanan yer.

2. *məc.* Qaranlıq, kiçik, yaşayışa yaramayan, natəmiz yer. *Bura ev deyil, itdamıdır.*

**İTDİRSƏYİ** *is.* Kirpik diblərində piy vəzilərinin irinli iltihabı; sızanaq. *Gözünə itdirsəyi çıxmaq. İtdirsəyini sıxdıqda, göz yuvasının fleqmonasına səbəb ola bilər.*

**İTƏBAXAN** *is.* Ov və ya xidmət itlərinə baxan adam.

**İTƏLƏYİCİ** *is. tex.* İşləmə zamanı mexanizmin müəyyən hissələrinin vəziyyətini təkanla dəyişdirən qurğu.

**İTƏLƏMƏ** "İtələmək"dən *f.is.*

**İTƏLƏMƏK** *f.* 1. Kəskin, ani bir hərəkətlə, təkanla bir şeyə toxunmaq. [Əmiraslan:] *..Nurəddin su çəkdiyi halda daldan itələyib suya salacağam.* S.S.Axundov. *Rüstəm kişi Telli arvadın yaxasından itələyib keçmək istədi.* M.İbrahimov. [Ağca] *ikiəlli Gəldiyevi itələdi, içəri salıb qapını bərk çırpdı.* Mir Cəlal.

2. Təkanla bir şeyi bir tərəfə doğru hərəkət etdirmək, yerini dəyişməyə məcbur etmək, yerindən tərpətmək. *Arabanı dala itələmək. Stolları yana itələmək.* – [Telli] *bir hadisə üz verdiyi təqdirdə, bu saman torba-*

*sını irəliyə itələməklə müəllimin otağına yol açar, onu öz harayına çağıra bilərdi.* S.Hüseyn. // Bir şeyi əli ilə və ya başqa bir şeylə özündən geriyə çəkmək, kənar etmək. *Mollanın oğlu qızılı əli ilə itələyir.* "Mol. Nəsr.". *Axund qəlyanı kənara itələyib dizi üstə qalxdı.* Mir Cəlal.

3. Soxmaq, yeritmək, daxil etmək. *Neştəri yaraya itələmək.*

4. *məc.* Təhrik etmək, sövq etmək, sürükləmək, bir şeyi etməsinə səbəb olmaq. *Cinayətə itələmək.*

**İTƏLƏNMƏ** "İtələnmək"dən *f.is.*

**İTƏLƏNMƏK** "İtələmək"dən *məch.*

**İTƏLƏŞMƏ** "İtələşmək"dən *f.is.*

**İTƏLƏŞMƏK** *qarş.* Bir-birini itələmək. *Bəzi adamlar kəndin içində əyri-üyrü yolla qaçışır, bir çoxu yenə də bir-birinə toqquşub itələşir və həyətə doluşurdu.* S.Rəhimov.

**İTGƏ** *is. dan.* Qızılquş və qırğı balalarına xalq arasında verilən ad.

**İTXİYARI** *is. bot.* Zibilli yerlərdə bitən, xiyara bənzər çoxillik yabanı bitki. *İtxiyarı, yetişmiş meyvəyə toxunduqda saplağından qopur, içərisindəki acı maye ilə birlikdə toxumu ətrafa yayılır.*

**İTİ** 1. *sif.* Yaxşı itilənmiş, kəskin, çox kəsici. *İti bıçaq. İti balta. İti ülgüc. İti qılınc.* // Ucu şiş, batıcı, deşici. *İti ox. İti tikan. – ..Heç bir zaval görməyəcəyini* [pişik] *hiss etdi, iti caynaqlarını qabırğaya ilişdirdi.* İ.Hüseynov.

2. *sif.* Getdikcə sivriləşən, ucu sivri, şiş. *Boz mərmərdən qayrılmış yazı cihazının üstündə iti* (z.) *qəddənmiş rəngli qələmlər görünürdü.* M.Hüseyn.

3. *zərf* və *sif.* Çox sürətli; tez, cəld, bərk çaparaq. *İti sürmək. İti yerimək. İti danışmaq. –* [Səməd] *əllərini solmuş çuxasının qollarına qoyub, .. küçənin ortası ilə iti ötür.* Çəmənzəminli. *Ancaq Məzlum üsulluca restoranı tərk etdi, iti addımlarla buradan uzaqlaşdı.* E.Sultanov. ..[Səmədin] *beyni elə bil əvvəlkindən də iti işləməyə başlamışdı.* İ.Hüseynov. // Sürətlə axan. *İti su. İti çay.*

4. *sif. məc.* Kəskin, nüfuzedici, çox təsirli. *İti söz. İti baxış. İti səs. – Onun iti nəzərləri geniş üfüqlərə nüfuz edir.* M.Hüseyn. *İşlədi knyazın geniş qəlbinə; Aşığın ox kimi iti sözləri.* M.Rahim. *Bahadır öz gur və iti səsi ilə çağırdı..* S.Rəhman. // Çox şiddətli, bərk. *İti çovğunlardan sonra yaz fəsli gəldi.* N.Nərimanov.

5. *sif. məc.* Tez qavrayan, tez başa düşən; fəhmli, qabil. *İti ağıl. İti zehni var. – Onun hazırcavablığı və açıqlığı, iti fikir sahibi olması bizə nə qədər xoş gələrdi..* M.İbrahimov.

**iti-iti** *zərf* Sürətlə, cəld, tez-tez. *İti-iti axmaq. İti-iti yazmaq. İti-iti danışmaq. – Tramvay sürətini artırdıqca* [Tahirin] *də fikri iti-iti işləməyə başlayırdı.* M.Hüseyn.

**İTİAXAN** *sif.* Sürətlə axan, tez axan. *İtiaxan çay.*

**İTİBAXIŞLI** *sif.* Baxışı kəskin, baxışından zirəklik, əzmkarlıq duyulan. *İtibaxışlı oğlan. – ..Onların içində bir nəfər qarayanız, itibaxışlı, sakitduruşlu bir gənc vardı.* Mir Cəlal.

**İTİBUCAQ(LI)** *is. riyaz.* İti bucağı olan həndəsi fiqur. // Buna oxşar hər hansı bir şey. *İtibucaqlı daş.*

**İTİBURUN** *sif.* Burnu sivri, şiş, iti. *İtiburun adam. İtiburun çəkmə.*

**İTİBUYNUZ(LU)** *sif.* Buynuzu iti olan. *İtibuynuzlu qoç. İtibuynuzlu çəpiş. – Biri var idi, biri yox idi, bir itibuynuz ala keçi var idi.* (Nağıl).

**İTİCƏ** 1. *sif.* Çox iti. *İticə bir bıçaq.*

2. *zərf* Çox iti, çox sürətli. *İticə yerimək.*

**İTİDƏMİR** *is. xüs.* Aşılanacaq gönün, dərinin üzərindəki ət qalıqlarını təmizləmək üçün ağzıiti dəmir alət.

**İTİDIRNAQLI** *sif.* Dırnaqları iti, sivri olan. *İtidırnaqlı quş. – Görsəydi havada itidırnaqlı; Yırtıcı dimdikli, qarmaqayaqlı; ..Vurardı başına ürəyindən qan.* H.K.Sanılı.

**İTİDİŞLİ** *sif.* Dişləri iti olan. *İtidişli çarx. İtidişli it. –* [Ana:] [Buğacı] *itidişli qaplanlara qapdırdınsa, gizlətmə, de!* M.Rzaquluzadə.

**İTİK** b a x **itki.** *Qonşu qonşunun itiyini bayatı çağıra-çağıra tapar.* (Ata. sözü). *Bu böyük itik, bu kədərli faciə .. ata-balaya bir vurğun kimi təsir etdi.* A.Şaiq. [Pəri:] [Mirzə] *sənin axtardığın itik bizdə tapılmaz.* ☐ **İtiyi itmiş** – bir şeyi itmiş, bir şeyi itirmiş. [Hacı Səfiqulu Şamoya:] *Əşi, buralar-*

*da nə gəzirsən? – dedi, – itiyi itmiş adam kimi, xəlvəti-xəlvəti?* S.Rəhimov.

**İTİGEDƏN** *sif.* İti sürətli, çox sürətli gedən.

**İTİGÖRƏN** *sif.* Gözdən iti olan. *İtigörən adam.*

**İTİGÖZ(LÜ)** *sif.* 1. Gözü iti, tez görən, ən incə şeyi görən. *İtigözlü adam. – Onu, o itigözlü, girdə və gülərüzlü müəllimi kim tanımır, kim əzizləmir?* Mir Cəlal.

2. *məc*. Sayıq, huşyar, həssas, diqqətli.

**İTİGÖZLÜLÜK** *is*. İtigözlü adamın hal və keyfiyyəti; ən incə şeyi görmə qabiliyyəti.

**İTİKÇİ** *is.* İtiyini gəzən, axtaran adam. *İtikçinin acığı dabanından çıxar.* (Məsəl).

**İTİKLİ** *sif.* Bir şey itirmiş, mühüm bir şeyi itmiş. [İlyas] *vaqonlara girib itikli adamlar kimi hamını bir-bir nəzərdən keçirirdi.* Mir Cəlal.

**İTİLƏLƏK** *sif.* Lələkləri iti olan.

**İTİLƏMƏ** "İtiləmək"dən *f.is.*

**İTİLƏMƏK** *f.* 1. Kəsici alətləri bülövə, çarxa, qayışa və s.-yə çəkməklə yaxşı kəsər hala gətirmək, kəskin etmək. *Bıçağı itiləmək. Baltanı itiləmək. Qayçını itiləmək. – Usta Hüseyn əllərini ətəklərinə silib götürdü ülgücü və başladı daşın üstə çəkib itiləməyə.* C.Məmmədquluzadə. // Hər hansı bir şeyin ucunu şiş, iti, sivri hala salmaq. *Ağacın ucunu itiləmək.*

2. *məc.* Qızışdırmaq, ürəkləndirmək, öyrətmək. *Səlim bəy hampalarnan bəyləri itiləyib dağıtdı kəndlərə.* "Qaçaq Nəbi".

3. *məc.* Kəskinliyini, təsir gücünü artırmaq, gücləndirmək. *Onlar özləri üçün nüfuz qazanmağa, istismar silahını itiləməyə çalışırlar.* M.S.Ordubadi.

**İTİLƏNMƏ** "İtilənmək"dən *f.is.*

**İTİLƏNMƏK** *məch.* İti hala gətirilmək, kəskinləşdirilmək. *Burada xəncərlər sulanır, itilənir, hər cür tüfənglər yoxlanır..* Mir Cəlal.

**İTİLƏŞDİRİLMƏ** "İtiləşdirilmək"dən *f.is.*

**İTİLƏŞDİRİLMƏK** *məch.* Daha iti edilmək, daha kəsərli hala salınmaq.

**İTİLƏŞDİRMƏ** "İtiləşdirmək"dən *f.is.*

**İTİLƏŞDİRMƏK** *f.* 1. Daha iti etmək, daha iti hala gətirmək.

2. *məc.* Kəskinləşdirmək, daha kəskin etmək.

**İTİLƏŞMƏ** "İtiləşmək"dən *f.is.*

**İTİLƏŞMƏK** *f.* Daha iti olmaq, daha kəskin olmaq. [Bəndalının] *yanaqları qızarmış, sümüyü bərkimiş, vücudu möhkəmlənmiş, baxışı itiləşmişdi.* Mir Cəlal. *İtiləşib dilləri; Kitabla cavab verir; Sualına hər biri.* B.Vahabzadə.

**İTİLƏTDİRMƏ** "İtilətdirmək"dən *f.is.*

**İTİLƏTDİRMƏK** *icb.* İtilətmək (başqası vasitəsilə). *Bıçaqları itilətdirmək. Ülgücləri itilətdirmək.*

**İTİLƏTMƏ** "İtilətmək"dən *f.is.*

**İTİLƏTMƏK** "İtiləmək"dən *icb.*

**İTİLƏYİCİ** *sif.* İtiləyən, kəskin hala salan.

**İTİLİK** *is.* 1. İti şeyin hal və keyfiyyəti; kəsicilik. *Bıçağın itiliyi. Baltanın itiliyi.*

2. Sürətlilik, tezlik, cəldlik. *Sürətin itiliyi. Yerişin itiliyi. Axının itiliyi.*

3. *məc.* Kəskinlik. *Ağlın itiliyi. – Mən bu cavan oğlanın gözlərinin itiliyinə .. heyran qaldım.* M.Rzaquluzadə.

**İTİLMƏ** "İtilmək"dən *f.is.*

**İTİLMƏK** *f. dan.* 1. Çıxıb getmək, rədd olub getmək, uzaqlaşmaq, gözdən yox olmaq: getmək. [Tükəz:] *Kişi, dəli olubsan! Mən evimdən hara itiləcəyəm?* M.F.Axundzadə. [Əbdürrəhman bəy:] *..Əbdürrəhim, sən atanın goru, tez bir çubuq gətir ver, durum itilim buradan..* N.Vəzirov.

2. Əmr şəklində: **itil, itil cəhənnəmə** şəklində – rədd ol! çıx bayıra! çəkil get! [Soltan bəy Əsgərə:] *Tez ol, itil buradan!* Ü.Hacıbəyov. [Nəcəf bəy Süleyman bəyə:] *İtil bu saat mənim evimdən!* Ə.Haqverdiyev. [Qumru:] *İtil buradan, bir qıy çəkərəm, dünya yığılar.* Mir Cəlal.

**İTİRİLMƏ** "İtirilmək"dən *f.is.*

**İTİRİLMƏK** "İtirmək"dən *məch.*

**İTİRMƏ** "İtirmək"dən *f.is.*

**İTİRMƏK** *f.* 1. Diqqətsizlik üzündən harada isə salmaq, yaxud məlum olmayan yerə qoymaq, hara qoyduğunu bilməmək. *Açarı itirmək. – ..Mən .. gördüm, pullarını itirmişdi, bütün ciblərini axtardı, çevirdi, axırda birindən tapdı.* C.Cabbarlı. // Qeyb etmək, əlindən çıxarmaq. *..Sevdiyi qızı həmişəlik itirə biləcəyi fikri* [gənci] *dəli edə bilərdi.* Ə.Əbülhəsən.

2 *məc.* Məhrum olmaq, qeyb etmək. *Oğlunu itirmək. Ərini itirmək. Dostunu itir-*

*mək. – Zəhra analarını itirmiş bu üç qızın halını, ürək parçalayan səmimi göz yaşlarını görərək ixtiyarsız gözləri yaşardı.* S.Hüseyn. ◻ **Ata-anasını (ata və anasını) itirmək** – yetim qalmaq. *Lap balaca yaşlarında o, ata və anasını itirmişdi.* M.İbrahimov.

3. Malik olduğu əvvəlki keyfiyyətindən məhrum olmaq. *Təravətini itirmək. Danışıq qabiliyyətini itirmək. İşləmək qabiliyyətini itirmək. – Araba yolunun kənarlarındakı qanqal və sirkanlar yaşıl rəngini çoxdan itirib bozarmışdı.* M.İbrahimov. *Sonradan kor olanlar gün işığından danışan kimi* [Səttarzadə] *də itirdiyi cavanlığından həsrətlə danışır.* Mir Cəlal.

4. Hədər yerə, mənasız, səmərəsiz sərf etmək. *Boş-boşuna pul itirmək. – Dünənki aydın havada Cavanşir qəsəbəsindən çıxmaması, günü hədər itirməsi Zərrintac xanımı ağrıdır.* S.Rəhimov.

5. Yox etmək, yoxa çıxarmaq. *Deyərəm, nökərlər başını kəsər; İtirərlər, qalmaz səndən bir əsər!* H.K.Sanılı. // Qovmaq, rədd etmək.

6. *məc.* Örtmək, gizlətmək. *Bu gün* [Salmanın] *paltarı bədəninin yastı-yapalaqlığını bir qədər itirirdi.* M.İbrahimov.

7. B a x **itirtmək**. [Əhməd:] *..Hərgah Cabbar bəy razı olsa, mən onun oğlunu bir gündə bu vilayətdən itirrəm.* N.Vəzirov.

8. Köməkçi feil kimi isimlərlə yanaşı işlədilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ağlını itirmək, başını itirmək, özünü itirmək, huşunu itirmək.

**İTİRTDİRMƏ** "İtirtdirmək"dən *f.is.*

**İTİRTDİRMƏK** b a x **itirtmək**.

**İTİRTMƏK** *icb.* Yox etmək, yoxa çıxartmaq, məhv etmək (başqasının vasitəsilə). // Rədd etmək, uzaqlaşdırmaq (başqasının vasitəsilə).

**İTİŞ** b a x **itik**.

**İTİUC(LU)** *sif.* Ucu iti (şiş, sivri) olan. *İtiuclu qüllə.*

**İTİYARPAQ(LI)** *sif.* Ucu iti olan (yarpaq). *İtiyarpaqlı ağac.*

**İTKİ** *is.* 1. İtirilmiş şey. *İtkisi olmaq.*

2. *məc.* Ölüm. *Bu böyük itki, bu kədərli faciə bütün qohum-qardaşa .. çox ağır təsir etdi.* A.Şaiq. *Rəiyyət Rüstəmin ailəsi bu ağır itki üçün .. matəm və yas saxladı.* S.Rəhimov.

3. Döyüş zamanı sıradan çıxmış əsgər və ya döyüş sursatı; zayiat. *Döyüşdə düşmən çoxlu itki vermişdir. – Tapdıq hələ taqımın başqa nə kimi itkisi olduğunu bilmirdi.* Ə.Əbülhəsən.

4. Ziyan, zərər; zay olma, xarab olma. *Məhsul toplanışında itkiyə yol verməməli. Təsərrüfatda hər cür itkinin qarşısını almalı. – Əziz görmüşdü ki, soyuqda, qarda, şaxtada yığılan pambığın çox itkisi olur.* Ə.Vəliyev. ◻ **İtkiyə düşmək** – ziyan çəkmək, zərərə düşmək.

**İTKİN** *sif.* İtmiş; xəbərsiz, soraqsız yox olan, yoxa çıxan. *Öldü Ziyad xanım, Mahmudum itdi; O itkin Mahmudun atasıyam mən.* Aşıq Kərəm. // İs. mənasında. *Bir mürüvvət eylə, alagöz şahım! Bir qərib itkinəm, yoxdur pənahım.* Aşıq Rəcəb. ◻ **İtkin düşmək** – 1) xəbərsiz, soraqsız itmək, yox olmaq. [Dərviş:] *..Məni nahaq yerə dolaşdırdılar, durmadım, itkin düşdüm.* A.Divanbəyoğlu. *İtkin düşdüyümü zənn edib, anama məktub yazacaqlar.* Mir Cəlal; 2) yox olmaq, itmək, aralıqda itib-batmaq. *Qiymətli əsərlərin itkin düşməsi, məncə, sizin kimi böyük rəssamı daha çox həyəcanlandırmalıdır.* M.Hüseyn. **İtkin getmək** – b a x **itkin düşmək** 1-ci mənada. **İtkin olmaq** – yox olmaq, itmək, itib-batmaq. *Ölsün, itkin olsun belə əğyarı; Gəzməsin arada yaman, bəri bax.* M.P.Vaqif. *Ol keçən dəmləri hanı Zakirin; İtkin olub adı-sanı Zakirin.* Q.Zakir. **İtkin salmaq** – itkin düşməsinə səbəb olmaq.

**İTKİNLİK** *is.* İtkin adamın halı; itib-batma, xəbərsiz-soraqsız yox olma. *Oğlunun itkinliyi anaya böyük dərd oldu.*

**İTKİSİZ** *zərf* 1. Ölüm, tələfat, zayiat olmadan, itki vermədən. *Bir dəstə rus soldatı yapon batalyonunun qarşısını almış və alayların itkisiz geri çəkilməsinə çalışmışdılar.* H.Seyidbəyli.

2. İtkiyə yol vermədən (b a x **itki** 4-cü mənada). *Məhsulu vaxtında və itkisiz yığmaq üçün lazımi tədbirlər görmüşlər.*

**İTQILIQ** *sif. dan.* Bədxasiyyət, rəftarsız, heç kəslə yola getməyən. *İtqılıq adam. – Veys acıdil və itqılıq olduğundan arvad-uşaqdan heç biri ağacın dibinə gəlməzdi.* Ə.Əbülhəsən.

**İTQIRDI: itqırdı salmaq** *dan.* – araya dava salmaq, qarmaqarışıqlıq törətmək. *Gərçi itqırdı salıb çoxların etdi ixrac; Leyk bundan belə olmaz qəmi-pünhanə ilac.* S.Ə.Şirvani.

**İT-QURD** *top. dan.* Tanınmayan, bilinməyən adamlar; yararsız, dəyərsiz adamlar mənasında təhqiramiz söz. *Dərənin iti-qurdu yığılıb bir yerə məsləhət edirlər.* Ə.Haqverdiyev. [Şiraslan:] *İtə-qurda dil açırsan, yalvarırsan, sonra da məlum olur ki...* M.Süleymanov.

**İTLƏŞMƏ** "İtləşmək"dən *f.is.*

**İTLƏŞMƏK** *dan. qarş.* Didişmək, çeynəşmək, bir-birini qapmaq.

**İTLİK** *is.* İtə məxsus xasiyyət və hal. *İt itliyini tərgitsə də, sümsünməyini tərgitməz.* (Ata. sözü).

**İTMAM** *is.* [*ər.*] *klas.* Tamamlama, sona yetirmə, axıra çatdırma, bitirmə. ☐ **İtmama yetirmək, itmam vermək (etmək)** – tamamlamaq, qurtarmaq, bitirmək. *Tarix nəvisi hali-əyyam; Bu qissəyə böylə verdi itmam.* Füzuli. [Teymur ağa:] *Bir neçə fikrim var, gərəkdir əvvəl onları itmama yetirəm.* M.F.Axundzadə. **İtmama yetmək (çatmaq)** – axıra çatmaq, bitmək, qurtarmaq. *Sözləri yetməmişdi itmamə; Ki uzaqdan göründü bir boğanaq.* A.Səhhət.

**İTMƏ** "İtməkdən" *f.is.*

**İTMƏK** *f.* 1. Yoxa çıxmaq, qeyb olmaq. [Koroğlu:] *Nigar, Dürətın itməyi; Yandırır məni, yandırır.* "Koroğlu". // Azmaq, azıb qalmaq, başqa yerə düşmək. [Səriyyə və uşaqlar] *bu qarışıqlığın, bu qaynar bataqlığın içində itməkdən qorxaraq, bərk-bərk bir-birinin əlindən tutur*(*lar*). M.İbrahimov. ☐ **Gözdən itmək** – görünməmək, görünməz olmaq, çəkilmək, yox olmaq. *Bağır həmişə gülümsəyəndə gözünün qarası itərdi.* Çəmənzəminli. *Şirzad yavaş-yavaş addımlayaraq yastı-yapalaq kənd evlərinin arasında itdi.* M.İbrahimov. // Gizlənmək, örtülmək. *Ay buludlar altında itdi.* ☐ **İtib-batmaq** – 1) yox olmaq, yoxa çıxmaq, məhv olmaq, itmək. *O gedən uşaq itib batdı. – Hər gün itib-batmadadır xanları; Mollaları, şeyx və işanları..* Ə.Nəzmi; 2) görünməz olmaq, gözdən itmək, yox olmaq. *Yolun alt-üstündəki kövşənlərdə küləş göy otun içində itib-batmışdı.* Ə.Vəliyev. *O, bəzən dalğaların arasında itib-batır, sanki bir müddət suyun altı ilə gedir.* M.Rzaquluzadə. [Carçıyevin] *gözləri qırışlar arasında daha da kiçilib, dərin çuxurlarda itib-batdı.* İ.Hüseynov; 3) tamamilə yox olmaq, puç olmaq, heç bilinməmək. [Rüstəm:] *Mənim ağlım belə kəsir ki, sənin savadın gərək itib-batmasın.* S.Rəhimov. **İtib getmək** – 1) başqa şeylər içərisində, arasında qeyb olmaq. *Hər şey dəniz kimi bərq vuran bir sərab içində itib gedirdi.* İ.Əfəndiyev; 2) bir yerə gedib qayıtmamaq, yoxa çıxmaq. *İki saatdır hara itib getmisən?* 3) yox olmaq, yoxa çıxmaq. *Pirkətanqulu pirinin şöhrəti və nüfuzu xalqın içində yavaş-yavaş bilmərrə itib getdi.* E.Sultanov. **İtib yox olmaq** – yoxa çıxmaq. [Dostəli:] *Tamam neçə aydır ki, şəhərimizin adamları itib yox olur.* Ü.Hacıbəyov.

2. Əvvəlki keyfiyyəti yox olmaq. *Yuyulandan sonra parçanın rəngi itib. Yaşa dolduqca gözün nuru itir. – Amma gənclik keçəndən, qocalıq gələndən, bədəndə təravət itəndən .. sonra, elə bil* [Mirzə Cavadın] *isti başına soyuq su töküb qəflətdən ayıltdılar.* Mir Cəlal.

3. *məc.* Puç olmaq, heçə çıxmaq, hədər getmək, boşa çıxmaq. *Vaxtım itir. Yaxşılıq itməz. Əməyi itmək. – Bizim dünyamızda itməz zəhmətin; Həyatın qəlbidir şerin, sənətin!* S.Vurğun.

4. *məc.* İçində sözü ilə: **...içində itmək** – bir şeyin bolluğunu, çoxluğunu bildirir. *Qızıl içində itmək. İpək içində itmək. – Müqim bəy vurnuxur, zər-ziba içində itən Zərintac xanımın mərhəmətini qazanmaq istəyirdi.* S.Rəhimov.

**İTMİL** *sif. məh.* Şiş, sivri. *Ağacın ucu itmildir.*

**İTMİLÇƏYİ** *is.* 1. *zool.* İri, sancan milçək.

2. *məc.* Adama yapışıb əl çəkməyən birisi haqqında. *İtmilçəyi kimi yapışmaq.*

**İTMİLLƏMƏK** *f. məh.* Dəmirin və ya ağacın ucunu şiş etmək, sivriləşdirmək, itiləmək, nazikləşdirmək. *Nizəni itmilləmək. Oxu itmilləmək.*

**İTOTU** *is. bot.* Quru və zibilli yerlərdə bitən bitki. *İtotu .. quru və zibilli yerlərdə*

*bitir. Bütün hissələri gönü aşılamaq üçün yararlıdır.* M.Qasımov.

**İTOYNADAN** *sif. dan.* Zarafatcıl, başqasına sataşmağı sevən (adam). [Səməd:] *Bəs eşitməmisiniz ki, Yusifə itoynadan Yusif deyirlər?* İ.Hüseynov.

**İTSARIMSAĞI** *is. bot.* Yabanı sarımsaq, sarımsağa oxşayan yabanı bitki.

**İTSOĞANI** *is. bot.* Zəhərli yabanı soğan, soğana oxşayan yabanı bitki.

**İTTİFAQ[1]** *is.* [*ər.*] 1. Ayrı-ayrı şəxslərin, qrupların, cəmiyyətlərin, siniflərin sıx birləşməsi, rabitəsi. *Fəhlələrlə kəndlilərin ittifaqı. Xalqların qardaşlıq ittifaqı.* // Ümumiyyətlə, birlik, söz birliyi, həmrəylik. *Hər işdə çü ittifaq xoşdur; Ağacdə pərü budaq xoşdur.* Xətayi. *İttifaq və ittihad çox gözəl işdi.* "Mol. Nəsr.". *Susdu bülbüllərin nədən, orman?! Pozdumu ittifaqını o xəzan?* A.Şaiq. □ **İttifaq eyləmək** *köhn.* – 1) birləşmək, söz bir eləmək. *İttifaq eyləyib diliranə; Durdular kim müqabil aslanə.* S.Ə.Şirvani; 2) ünsiyyət yaratmaq, yaxınlaşmaq. *Sevdiyim məni dağ eylər; Qeyrilə ittifaq eylər.* Q.Zakir.

2. Birlikdə hərəkət etmək və başqa məqsədlər üçün dövlətlər, təşkilatlar arasında dostluq sazişi; birləşmə. *Diplomatik ittifaq. Hərbi ittifaq. Ticarət ittifaqı.* □ **İttifaq bağlamaq** – aralarında birlik yaratmaq, birləşmək, söz birliyi etmək. **İttifaqa girmək** – əlbir olmaq, əlaqəyə girmək, birgə iş görmək üçün birləşmək.

3. Bir ümumi ali hakimiyyəti olan bir neçə dövlətin, ərazinin, xalqın, tayfanın və b.-nın dövlət birləşməsi. *Qəbilələr ittifaqı. Avstraliya ittifaqı.*

4. İctimai təşkilat, birlik. *Həmkarlar ittifaqı. Yazıçılar ittifaqı. Rəssamlar ittifaqı.* – *Məsmə bir ittifaq üzvünün istifadə edə biləcəyi bütün hüquq və imtiyazlardan istifadəyə çalışır.* S.Hüseyn. [Qəhrəmanı] *bütün müəllim yoldaşları ittifaq sədri seçdilər.* S.Rəhimov.

5. **İttifaq ilə, ittifaqla** şəklində *zərf* – bax **ittifaqən**[1]. *İttifaqla hərəkət etmək. Qərar ittifaqla qəbul edildi.* – *Hər bir taifə bir sayaq ilə; Çatdı izzətə ittifaq ilə.* M.Ə.Sabir.

**İTTİFAQ[2]** *is.* [*ər.*] Qəziyyə, vəqə, əhvalat, hadisə. [Əsgər bəy:] *Amma, mən ölüm, inciməyin, yoldaş arasında belə ittifaqlar çox olar.* Ə.Haqverdiyev. [Aslan:] *Mən bu az ömrümdə nə qədər bədbəxt ittifaqlar görmüşəm.* İ.Musabəyov. □ **İttifaq düşmək (olmaq)** – bir hadisə, qəza, iş baş vermək. [Nuxulular:] *Hələ ki belə ittifaq düşübdür, biz bilməmişik, indi bunun çarəsi nədir?* M.F.Axundzadə. [Cahangir ağa:] *Xoca Bəhmənlidə, görəsən, nə ittifaq olub?* Ə.Haqverdiyev. [Fəxrəddin bəy:] *Bircə de görüm, Səadət salamətdirmi, nə iş ittifaq düşüb?* N.Vəzirov. // Təsadüf, fürsət, məqam, imkan, vaxt. [Ağa Kərim xan:] *..Mənim ixtiyarım yoxdur, belə gözəl ittifaqda onu ərə verəm, ha?* N.Vəzirov. *Qohumlarda birinin oğlu və o birinin qızı doğulan ittifaqlarda da bu uşaqları beşikkəsmə ad edirlər.* R.Əfəndiyev. □ **İttifaq düşmək** – təsadüf düşmək, fürsət ələ keçmək, imkan olmaq. *Birdən ittifaq düşdü ki, usta Ağabala .. Ağa Ələsgər ilə gəzməyə çıxdı.* Çəmənzəminli. *Süleyman bu sözü eşidən kimi təəccüb barmağını dişləyib dedi: – Bəli, dünyada belə işlərə çox ittifaq düşər.* Ə.Haqverdiyev.

**İTTİFAQARASI** bax **ittifaqlararası**.

**İTTİFAQƏN[1]** *zərf* Birləşərək, birgə, həmrəyliklə, yekdilliklə.

**İTTİFAQƏN[2]** *zərf* Təsadüfən, gözlənilmədən, birdən. [Hacı Mehdi:] *İttifaqən külək övrətin çadrasını başından atdı.* Ə.Haqverdiyev. [Rəşid:] *İttifaqən Qurbanqulunun bacısı azarlayır.* T.Ş.Simurq. *İttifaqən bu gün Cahanın nə atası və nə qardaşı ilə anası evdə var idi.* İ.Musabəyov.

**İTTİFAQLARARASI** *sif.* İttifaqlar arasında aparılan, ittifaqlar arasında olan. *İttifaqlararası saziş.*

**İTTİHAD** *is.* [*ər.*] *köhn.* 1. Birləşmə, birlik, ittifaq. *Sən o deyilmidin, dedin: – Var bizim ittihadımız? Mən də yadında var, dedim: – Yox buna etimadımız.* M.Ə.Sabir. // Həmfikirlik, yekdillik, həmrəylik, əlbirlik. □ **İttihad etmək** – birləşmək, birlik, ittifaq yaratmaq, həmrəy olmaq, həmfikir olmaq. *Doğru bir ittihad etməsək biz; Birliyə etiqad etməsək biz; Bizdə şərti-üxüvvət olurmu?* M.Ə.Sabir.

2. **İttihad ilə, ittihadla** şəklində *zərf* – birləşərək, birlikdə, həmrəyliklə, yekdil-

liklə, ittifaqla. *İttihad ilə, ittifaq ilə; Üzünü hər məkanda ağ eylə.* S.Ə.Şirvani. *Xülasə, İnmirə məhəlləsinin camaatı .. artıq dərəcədə cidd-cəhd edər və öz arasında böyük ittihadla iş görərdi.* N.Nərimanov. *Bir-birimizə piyalə, qədəhi; İttihad ilə uzatdıq bu gecə!* Ə.Nəzmi.

**İT(Tİ)HAF** *is.* [*ər.*] Hədiyyə etmə, töhfə vermə; hədiyyə, töhfə. *Ürəyin ürəyə öz ithafını; Ayrı bir mətləbə yozmaq olarmı?* B.Vahabzadə. ☐ **İt(ti)haf etmək** – bağışlamaq, hədiyyə etmək, vermək, həsr etmək. *Şair bu poemanı böyük Üzeyir bəyin işıqlı xatirəsinə ithaf edib. – Aşıq, Bəsti Bağırovaya və onun yoldaşlarına ithaf etdiyi şeri oxumağa başladı.* Ə.Sadıq.

**İTTİHAM** *is.* [*ər.*] Birinə qarşı irəli sürülən günah, təqsir, suç. *Bu sözlər bir ittiham kimi səsləndi. – Sən bu ittihamı öz üzərindən nə kimi bir sübutla götürə biləcəksən?* M.S.Ordubadi. *Hacı bu ağır ittihamın təsirini yoxlayan kimi bir qədər susdu, ətrafına baxındı..* Mir Cəlal. ☐ **İttiham edilmək** – təqsirləndirilmək, günahlandırılmaq, müttəhim edilmək, suçlandırılmaq. *Qalınqaş oğlan depoda çalışan və tətildə ittiham edilib həbsə atılan Namazoğlu Qiyas idi.* Mir Cəlal. **İttiham etmək** – təqsirləndirmək, günahlandırmaq, müttəhim etmək, suçlamaq. *Prokuror vətəndaş Yaşarı ittiham etməkdən boyun qaçırır.* C.Cabbarlı. *Mürtəce dairələr və xarici mənbələr Azərbaycan demokratlarını .. ittiham etməyə başladılar.* M.İbrahimov.

**İTTİHAMÇI** *is.* Məhkəmədə müqəssiri ittiham edən şəxs. *Dövlət ittihamçısı* (prokuror). *İctimai ittihamçı. – Məhkəmə ittihamçısı stolun dalında duraraq müttəhimlər kürsüsündə oturan gəncin təqsirlərini oxuyur.* M.S.Ordubadi.

**İTTİHAMKAR** *sif.* [*ər.* ittiham və *fars.* ...kar] İttihamedici, təqsirləndirici, günahlandırıcı. [Surxay] *öz dostuna qarşı ittihamkar mühakimələr yürüdürdü.*

**İTTİHAMNAMƏ** *is.* [*ər.* ittiham və *fars.* namə] *hüq.* Müttəhimə verilən təqsirnamə, ittiham vərəqəsi.

**İTTİKANI** *is. bot.* Aran yerlərdə yayılmış tikanlı kol; keçibuynuzu. *Keçibuynuzu və ya ittikanı 2 metrə qədər hündürlükdə, qışda yarpağı tökülən koldur.* H.Qədirov.

**İTÜZÜMÜ** *is. bot.* Üzümə bənzər qırmızı meyvəsi olan, tikanlı, yabanı kol-bitki və onun meyvəsi.

**İTYATMAZ** *sif. vulq.* Çox pis, çox bərbad, insana layiq olmayan, natəmiz. *İtyatmaz dam. İtyatmaz yer.* – [Xortdan:] *Axırda cındır, ityatmaz fayton tapıb, ona yanaşıb faytonçuya deyərdi..* Ə.Haqverdiyev.

**İTYERİŞİ** *is. dan.* Xırda sürətli addım. *İtyerişi* (z.) *yerimək.*

**İY**[1] *is.* Maddələrin, şeylərin burun qişasının xüsusi sinirlərinə təsir etmə xassəsi. *Kəskin iy. İy duymaq. Onun burnu yaxşı iy bilir. – Güllərin ətri otların iyinə qarışıb, ətrafa saçılmaqda idi.* T.Ş.Simurq. *Həyati götürən soğan, qovurma, zəfəran iyi adamı valeh edirdi.* Mir Cəlal.

◊ **İy almaq** – 1) harada olduğunu duymaq, izinə düşə bilmək, axtarıb tapmaq. *..Jandarm idarəsi iy almaqda ov tulasından belə həssasdı.* M.Hüseyn. *İyinizi alıblar! Ceyran çox həssas heyvandır, – deyə Almurad baba bizi başa saldı.* İ.Əfəndiyev; 2) xörək, gül və ya xarab olan bir şeyin qoxusunu hiss etmək. *..Leylək bir qədər gedəndən sonra, cızbız iyi aldı.* S.Rəhimov. **İy çəkmək** – b a x **iy almaq**. *İy çəkirlər tulatək ta ki, görüb harda var aş; Kimdə var ağca plov, hər gecə yağlı bozbaş.* S.Ə.Şirvani. *Burada Zeynal dayanıb, burnunu sağa-sola döndərərək iy çəkdi.* Ə.Əbülhəsən. **İy götürmək (basmaq)** – hər tərəfə iy yayılmaq. **İy vermək** – 1) iylənmək, qoxumaq. *Ət iy verir;* 2) *dan.* üstüörtülü, eyhamlı, ikibaşlı söz, danışıq haqqında. *Sənin sözün iy verir.* **İy(i) burnundan getməmək** – xoş qoxulu bir şeyin ətrini daim hiss etmək, duymaq. *Sən bu yerin canısan; Sultanısan, xanısan; İyin burnumdan getməz; Təbrizin reyhanısan.* (Bayatı).

**İY**[2] *is.* Pambıqdan, yundan və s.-dən iplik əyirmək üçün ortası şiş, iki ucu sivri ağac alət. *Qərənfil bacı gözünü əlindəki iydən çəkib hirsli-hirsli .. baxdı..* İ.Əfəndiyev. [Tapdıq] *bir gün tezdən anasından xəbərsiz durub tağalağı iyin üstündən çıxartdı, cibinə qoydu.* Ə.Vəliyev. *İndi cəhrə uğuldayır,*

*uğuldadıqca yun əlçim eşilib sapa dönərək iyə toplanırdı.* Ə.Əbülhəsən.

**İYBİLMƏ** *is.* İyləri duyma qabiliyyəti.

**İYCİL** *sif. ovç.* İyi tez hiss edən, iyi tez duyub ov dalınca düşən. *İycil it. – Hiyləgər düşmən iycil tula kimi işi duymuşdu.* Ə.Vəliyev.

**İYDƏ** *is. bot.* İsti yerlərdə bitən, ətirli çiçəkləri olan ağac və bu ağacın dərisi sərt, əti ağ un halında olan meyvəsi. *İydə 8-10 metrə qədər, bəzən alçaqboylu, qışda yarpağı tökülən ağacdır. Çiçəkləri ətirlidir, mayda açılır, meyvəsi avqustda yetişir və yeyilir.* H.Qədirov. *Faytonumuz yenə də iydə ağaclarının kölgəsi ilə örtülmüş çala-çuxur yollarla gedirdi..* M.S.Ordubadi. *İydənin ətri indi daha kəskin duyulurdu.* İ.Əfəndiyev.

**İYDƏLİ** *sif.* İydə ağacları olan. *İydəli bağ.*

**İYDƏLİK** *is.* İydə ağacları əkilmiş yer. *Odur, kölgəsi var iydəliklərin: Ərinmə, sevgilim, dur gedək, vaxtdır.* S.Vurğun. *..Dəyirmanın üst tərəfindəki iydəlikdən bir dəstə qadın çıxdı.* S.Şamilov.

**İYÉN** *is.* [*yap.*] Yaponiyanın pul vahidi.

**İYERARXİYA** *is.* [*yun.*] Bütöv bir sistemin hissələrinin aşağıdan yuxarıya tabeçilik əlaqəsi əsasında düzümü, yerləşməsi.

**İYHAM** b a x **eyham**.

**İYİMƏ** "İyimək"dən *f.is.*

**İYİMƏK** b a x **iylənmək**.

**İYİMİŞ**[1] *f.sif.* Qoxumuş, üfunətli, pis iy verən. *İyimiş balıq.*

**İYİMİŞ**[2] *is. bot.* Dağlıq yerlərdə bitən pis iyli bir kol-ağac.

**İYİR** *is. bot.* Bataqlıq zanbağı.

**İYİRMİ** *say.* On doqquzdan sonra gələn say – 20. *İyirmi manat. İyirmi ədəd. İyirmi gün. – Hələ işin başlanmasına iyirmi dəqiqə var..* M.Hüseyn.

**iyirmi-iyirmi** *zərf* Hər birinə, yaxud hər dəfəsinə iyirmi. *Əsgərləri iyirmi-iyirmi düzmək. Uşaqları iyirmi-iyirmi ayırmaq.*

**iyirmi...** – bu sayla əlaqədar olan bir sıra mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: iyirmibeşlik, iyirmiqəpiklik.

**İYİRMİBEŞLİK** 1. *is.* İyirmi beş manatlıq kağız pul. *İyirmibeşliyi xırdalamaq.*

2. *sif.* İyirmi beş nömrəli. *İyirmibeşlik lampanın şöləsi naqanın qara sümük zağlı lüləsini, topunu işıqlatdı.* Ə.Əbülhəsən. *Səqfdən asılan iyirmibeşlik bir lampa buranı güclə işıqlandırırdı.* P.Makulu.

3. *sif.* İyirmi beş ədəd tutan. [Qurban:] *Al bu pulu, bu saat yüyür, bir paçka iyirmibeşlik papiros al.* Ə.Haqverdiyev.

**İYİRMİCƏ** *say.* Ancaq iyirmi, yalnız iyirmi. *İndi səkkiz il idi ki, muzdur Məşədi Əsgər Qanlıtəpədə bir arvadı və üç baş xırdaca uşaqları ilə ayda iyirmicə manat məvacibə qənaət edib dolanırdı.* S.M.Qənizadə. *Cəmisi iyirmicə kilometr aralı çay axır, ancaq biz gərək o dərədən, bu dağdan damcı-damcı su yığaq..* İ.Hüseynov. // Bəzən təyin etdiyi sözə böyüklük, çoxluq mənası verir. *Zarafat deyil, parçaya iyirmicə manat pul vermişəm.*

**İYİRMİGÜNLÜK** *sif.* İyirmi gün sürən və ya sürmüş. *İyirmigünlük ezamiyyət. İyirmigünlük gəzinti.* // İyirmi gün vaxt tələb edən. *İyirmigünlük işimiz qalıb.*

**İYİRMİİLLİK** *sif.* 1. İyirmi il davam etmiş. *Dostluqlarının iyirmiillik tarixi var. İyirmiillik bir dövr. İyirmiillik mübarizə.*

2. İyirmi illiyə həsr olunmuş; iyirmi ilin tamam olması ilə əlaqədar olan. *İyirmiillik yubiley.*

**İYİRMİQƏPİKLİK** 1. *sif.* İyirmi qəpik qiyməti olan, iyirmi qəpiyə dəyən. *İyirmiqəpiklik kitabça.*

2. *is.* Dördşahılıq metal pul. *İyirmiqəpikliklər yerə töküldü.*

**İYİRMİLİK** *sif.* 1. *köhn.* İki onluqdan ibarət pul. *Dostum, iyirmilikdən qalan beş manatı neylədin?* Mir Cəlal.

2. İyirmi nömrəli.

**İYİRMİNCİ** "İyirmi"dən *sıra s. İyirminci sıra. İyirminci otaq. İyirminci il. İyirminci əsrin ilk onillikləri.* – [Qəhrəman:] *İyirminci ildə bu şəhərdə üsyan olduğunu bilirsiniz?* H.Nəzərli.

**İYİTMƏ** "İyitmək"dən *f.is.*

**İYİTMƏK** b a x **iylətmək**.

**İYLƏMƏ** "İyləmək"dən *f.is.*

**İYLƏMƏK** *f.* 1. Burunla nəfəs çəkərək, bir şeyin qoxusunu duymağa çalışmaq, qoxulamaq. *Arxın suyun kəs, doldu; Bağda gülün dəst oldu; Yara bir gül göndərdim; İyləyincə məst oldu.* (Bayatı). [Bəhram:] *Mən qızdırmalı kimiyəm. Bu çiçəkləri iylə-*

*yim, bəlkə bir az təskin tapım.* C.Cabbarlı. *İncimə, o gülü canan iyləsin; O da bir gözəlin al yanağıdır.* M.Rahim.

2. *məc.* Öyrənib bilməyə çalışmaq, arayıb yoxlamaq, hər yerə baş soxmaq, axtarıb araşdırmaq.

**İYLƏNDİRMƏ** "İyləndirmək"dən *f.is.*

**İYLƏNDİRMƏK** b a x **iylətmək**.

**İYLƏNMƏ** "İylənmək"dən *f.is.*

**İYLƏNMƏK** *f.* Qoxumaq, iy vermək, xarab olmaq, ağırlaşmaq, üfunətlənmək. *Ət iylənmişdir. Pendir iylənmişdir, yemək olmur.*

**İYLƏNMİŞ** *f.sif.* Qoxumuş, xarab olmuş, ağırlaşmış. *İylənmiş balıq. – ..Get iylənmiş qatığını satmağa! – baqqala belə cavab verib, dəli Səməd adamların arasında itdi.* Çəmənzəminli.

**İYLƏŞMƏ** "İyləşmək"dən *f.is.*

**İYLƏŞMƏK** *qarş.* Bir-birini iyləmək, qoxulamaq. – *..İtlər bir-birindən çəkinə-çəkinə burun-buruna iyləşdilər.* M.Rzaquluzadə.

**İYLƏTMƏ** "İylətmək"dən *f.is.*

**İYLƏTMƏK** *icb.* 1. Bir şeyi çox saxlayıb qoxutmaq, xarab etmək, köhnəltmək, çürütmək, iylənməsinə səbəb olmaq. *Pendiri çox saxlayıb iylətmək. Balığı iylətmək.*

2. Qoxulatmaq. *Çiçəyi hamıya iylətmək.*

**İYLİ** *sif.* Müəyyən iyi, qoxusu, ətri olan. *Bu dağların meşəsi; İylidir bənövşəsi; Könülsüz gedən qızın; Ağlamaqdır peşəsi.* (Bayatı).

**İYNƏ** *is.* 1. Tikiş tikmək üçün bir ucu sivri, digər ucu isə sap keçirilmək üçün deşikli metal milcik. *Tikiş iynəsi. Maşın iynəsi. – Yusif Sərrac iynəsi əlində başını yuxarı qovzadı.* M.F.Axundzadə. *..Gözəl ufuldadı, fikri Pəri nənədə olduğundan əlinə iynə batmışdı.* M.Hüseyn. ☐ **İynə vurmaq (çalmaq)** – tikiş tikmək, tikiş tikməklə məşğul olmaq. *Sərdar evlərinin qabağında bir daxmaya girib, işi səhərdən axşama kimi başaşağı iynə vurmaqdadır.* C.Məmmədquluzadə. *Dilşad böyüyəcək, anası kimi mətbəxdə yerdə oturub xörək bişirmək, teşt içində paltar yumaq, dizi üstündə iynə çalmaqdan başqa artıq bir şey bilməyəcək..* T.Ş.Simurq.

2. Hər hansı bir xəstəliyə əks-təsir etmək və onun qarşısını almaq məqsədi ilə dəri altına dərman yeritmək üçün tibdə işlənən alət. *Həkim iynəni qaynadıb, Tahirin yumşaq ətinə .. vurdu.* M.Hüseyn. // *dan.* Həmin alətlə bədənə yeridilən maye (dərman). *Penisillin iynəsi. Qan iynəsi. Qlükoza iynəsi.* ☐ **İynə vurmaq** – müalicə məqsədi ilə tibb iynəsi vasitəsilə bədənin bir yerinə dərman yeritmək. *Səhiyyə şöbəsinin əmri ilə uşaqlara iynə vururduq.* Mir Cəlal.

3. Müxtəlif məqsədlər üçün metaldan qayrılmış ucu iti incə milcik. *Patefon iynəsi.*

4. Bəzi böcəklərdə sancan üzv. *Arı iynəsi.*

5. Bəzi heyvanların bədənini örtən tikanlar. *Kirpinin bədəni iynələrlə örtülüdür.*

6. Şam ağacı kimi ağacların yarpağı. *Şam ağacının iynələri.* // Tikan (bəzi bitkilərdə).

7. Ümumiyyətlə, ucu şiş, batan şeylər haqqında. *Buz iynələri.*

8. *məc.* Toxunan söz, acı söz. *Hər sözü tənədir, bir top iynədir.* A.Şaiq. *Müəllimin sözlərində zəhərli iynələr olduğunu molla Xəlil hiss edirdi.* S.Hüseyn.

◊ **İynə ağzından çıxmış** – təzəcə tikilmiş (paltar). **İynə atmağa yer yox idi** – b a x **iynə atsan yerə düşməz**. – *Küçədə iynə atmağa yer yox idi.* M.Hüseyn. **İynə atsan yerə düşməz** – çox tünlük, qələbəlik, son dərəcə çox adam olan yer haqqında. *Bazarda adam əlindən iynə atsan yerə düşməzdi. – Kiçik stansiyada iynə atsan yerə düşməz.* S.Şamilov. **İynə batırana şiş (biz) batırmaq** – üstəlik əvəz çıxmaq, daha çox pislik etmək. **İynə ilə gor qazımaq** – çox böyük zəhmət və əziyyət tələb edən çətin və ağır işlə məşğul olmaq. [Şeyda Araza:] *..Orada bağ salmaq, əkin becərmək iynə ilə gor qazımaqdır.* A.Şaiq. **İynə itsə tapılar** – çox işıqlı yer haqqında. **İynə salmağa (düşməyə) yer yoxdur** – b a x **iynə atsan yerə düşməz**. **İynə ucu boyda** – son dərəcə kiçik şey haqqında. **İynə üstə (üstündə) oturan kimi** – çox həyəcan, təlaş keçirmə, təlaş içində olma, narahat olma. *..Gəray ağa müsahibi Ağaxanla dərdləşir, iynə üstündə oturan kimi bir yerdə qərar tuta bilmirdi.* S.Rəhimov. **İynədən sapa qədər** – hər şey, hər nə varsa, başdan-başa. *İynədən sapa qədər götürmək. – Xalıqverdinin evi iynədən sapa qədər axtarıldı.* Ə.Vəliyev. **İynəsi tikiş tutmaq** – arzusu yerinə yetmək, işi

düzəlmək, bəxti gətirmək. **İynəyə qədər (kimi)** – ən kiçik, ən cüzi şeyə qədər, başdan-başa, hamısı. *İynəyə qədər hər şeyi yığıb aparmaq.* **Elə bil iynəsi itib** – aralıqda vurnuxan, ora-buranı axtaran, qurdalanan adam haqqında.

**İYNƏBURNU** *is.* Şirin, qırmızı, sivriuclu çəyirdəyi olan gavalı növü.

**İYNƏCİK** *is.* Kiçik iynə.

**İYNƏDİŞ** *sif.* İti, nazik dişləri olan. *İynədiş adam.*

**İYNƏDOĞAN** *is. zool.* Sürətlə uçan kiçik bir quş. *Uşaqlar bağdan iynədoğan tutmuşlar.*

**İYNƏQABI, İYNƏDAN** *is.* İynə qoymaq üçün balaca qutu.

**İYNƏLƏMƏ** "İynələmək"dən *f.is.*

**İYNƏLƏMƏK** *f.* 1. İynə batırmaq, ucu şiş bir şey batırmaq; sancmaq.

2. İynə ilə bədənə dərman yeritmək, iynə vurmaq. [Uşaq dedi:] *Doktor, məni də iynələ!* Mir Cəlal.

3. İynə ilə tikmək, yamamaq və s. *Yorğanın cırığını iynələmək.*

4. Sancaqlamaq, bir-birinə bənd etmək, rəbt etmək. *Kağızları iynələmək.*

5. *məc.* Sancmaq, acılamaq, qəlbinə toxunmaq, toxunan sözlər demək. [Əlyarov:] *Düzələn adam deyil. Əvvəldən vardı hüsncamalı, indi olub dəli Bayramalı! – deyə o yenə Xəlili iynələdi.* M.Hüseyn. *Gülşən Eyvazı sevdiyini nə qədər gizlətsə də, qızlar bunu duyur, Gülşəni iynələməyə çalışırdılar.* Ə.Vəliyev.

**İYNƏLİ** *sif.* 1. İynəsi olan (b a x **iynə** 3, 4, 5 və 6-cı mənalarda).

2. *məc.* Kinayəli, istehzalı, qəlbə toxunan, acı. [Əşrəf] *Zəkinin iynəli sözlərini xatırladıqca nəşəsizliyi daha da artır.* A.Şaiq. [Müqim bəy Cavanşirə:] *Axı, mən heç bilmirəm, bu iynəli sözlər haradan sənin beyninə giribdir.* S.Rəhimov. *Güldüm, dedim: – Nə yaman; İynəli diliniz var; Uşaqlar, ay uşaqlar!* R.Rza.

**İYNƏŞƏKİLLİ** b a x **iynəvari**.

**İYNƏVARİ** *sif.* İynə kimi, iynəyə oxşar, ucu şiş. *İynəvari yarpaq.*

**İYNƏYARPAQ(LI)** *sif.* Yarpaqları iynə şəklində (şiş, iti) olan. *İynəyarpaqlı ağac. Azərbaycanın yalnız bəzi meşələrində iynəyarpaqlı ağaclara rast gəlmək olar. – Adi şam növü iynəyarpaqlı və qarışıq meşələrdə ən geniş yayılmış şam növüdür.* H.Qədirov.

**İYNƏYARPAQLILAR** *is. bot.* Həmişəyaşıl və yarpaqları iynə kimi şiş və ya inkişaf etməmiş halda olan çılpaqtoxumlu ağaclar və kollar sinfinin adı.

**İYRƏNC** *sif.* 1. Özünə nifrət doğuran, ikrah doğuran, qətiyyən xoşa gəlməyən, mənfur, çox çirkin. [Zeynalın] *üzü olduqca iyrənc bir hal almışdı.* S.Hüseyn. *Salman havalanıb pörtərək, eybəcər və iyrənc şəklə düşdü.* M.İbrahimov. [Casus] *bayquş kimi boyunsuz, bədəninə görə yekə, lakin mütəhərrik başını əcaib və iyrənc* (z.) *bir surətdə hərləyib, .. qapıya baxdı.* M.Rzaquluzadə.

2. *məc.* Rəzil, yaramaz, alçaq, mənfur. *..Mən sənə söz verirəm, artıq bu iyrənc yolu təqib etməyəcəyəm.* M.S.Ordubadi. *"Şamdan bəy" komediyasında da yazıçı bizi keçmişin iyrənc tiplərindən birisi ilə tanış edir.* M.Arif.

**İYRƏNCLİK** *is.* İyrənc şeyin hal və keyfiyyəti; çirkinlik. // İyrənc şey, iyrənc hərəkət; rəzalət, yaramazlıq, alçaqlıq. *Atamgil həyətdəki iyrəncliyi görən kimi söhbəti kəsdilər.* Ə.Vəliyev.

**İYRƏNDİRMƏ** "İyrəndirmək"dən *f.is.*

**İYRƏNDİRMƏK** *f.* İyrənməsinə, nifrətinə səbəb olmaq, ikrah etdirmək, çiyrəndirmək.

**İYRƏNMƏ** "İyrənmək"dən *f.is.*

**İYRƏNMƏK** *f.* Məzac qəbul etməyən, xoşa gəlməyən şeydən ikrah etmək, diksinmək, nifrət etmək, görə bilməmək, çiyrənmək. *İyrənmişəm ağzının suyundan; Qatran qoxusu gəlir buyundan.* M.Ə.Sabir. *..Zeynəb Xudayar bəydən elə iyrənirdi, necə ki, insan qurbağadan iyrənər.* C.Məmmədquluzadə. *Mən dünyada hər şeydən artıq yaltaq adamlardan iyrənirəm.* M.S.Ordubadi.

**İYSİZ** *sif.* Heç bir iyi, ətri olmayan. *İysiz çiçək.*

**İYSİZLİK** *is.* Heç bir iyi, ətri olmayan şeyin hal və keyfiyyəti.

**İYŞƏKİLLİ** b a x **iyvari.**

**İY-TOZ: iyi-tozu qalmamaq** – əsər-əlaməti qalmamaq, heç bir izi qalmamaq, tamam yoxa çıxmaq, izsiz itmək. *Vaxtilə gördüyün şeylərin iyi-tozu qalmayıb.* – [Sultan

bəy:] *Qoy bir o arşınmalçı gözümə görünsün, ona mən bir patron çaxım ki, iyi-tozu qalmasın.* Ü.Hacıbəyov; **iyi-tozu görünməmək** – qətiyyən hiss olunmamaq, varlığından heç bir əsər-əlamət olmamaq. *Burada da onların iyi-tozu görünmür.*

**İYÚL** [*lat.*] Təqvim ilinin yeddinci ayı. *İyul ayının axırında Dilicanın ətrafındakı yaylaqlarda sakin olan el-oba bir vaxtda dolur Dilican dərəsinə.* F.Köçərli. *Göydən yerə od yağdıran iyul günəşi çoxdan günorta yerinə qalxmış, hətta bir az da qərbə sarı əyilmişdi..* M.Hüseyn.

**İYÚN** [*lat.*] Təqvim ilinin altıncı ayı. *İyun gecəsi sərinləşdikcə, elə bil* [İkram] *üşüyür, boynunu içinə çəkib getdikcə daha çox büzüşürdü.* Ə.Əbülhəsən. *Bayırda gözəl ılıq dağ yerlərinə məxsus yüngül təravətli bir iyun sabahı açılırdı.* M.Rzaquluzadə.

**İYVARİ** *sif.* İyə oxşar, iy kimi. *İyvari ağac. İyvari mil.*

**İZ** *is.* 1. İnsan və ya heyvan ayağından səth üzərində qalan nişanə; ləpir. *Canavar izi. Qarın üstündə dovşan izi var. – Talada quzu gördüm; Bir maral izi gördüm; Endim bulaq üstünə; Sevdiyim qızı gördüm.* (Bayatı). *Dəvə ləpirindən, ayaq izindən; Yolların sinəsi oyuq-oyuqdur.* R.Rza. *Un ələnmiş kimi ağımtıl, sarı şoran torpağın üzərində təzəcə ceyran izləri aydın görünürdü.* M.Rzaquluzadə. // Bir şeyin hərəkətindən sonra səth üzərində qalan çuxurluq, xətt, şırım, əlamət və s. *Maşın izi. – Abşeron yarımcəzirəsinin dərya kənarında olan daşları üstə araba çərxlərinin izi görünməkdədir.* H.Zərdabi.

2. Hər hansı bir şeydən qalan və onun keçmiş varlığına şəhadət edən nişanə, əsər, qalıq, əsər-əlamət. *O gözdə incə bir sirr var, bilinməz; O necə baxışdır, izi silinməz.* A.Şaiq. *..Qocalığın mənfur izlərini təşkil edən qırışıqları ən əla kirşanlar və boyalar örtə bilməsə də, şamların işığı lazımınca örtə bilər.* M.S.Ordubadi. *Daşlarda, qayalarda izi qaldı; Uzaqlaşan hər əsrin.* O.Sarıvəlli. // Ümumiyyətlə, bir hadisənin, keyfiyyətin və s.-nin olmasına şəhadət edən hal, əlamət, nişanə, qalıq. *Cinayətin izləri. Müharibənin izləri. – Hüseynəli əminin söhbətləri mənə böyük bir xəyanətin izlərini nişan verirdi.* M.S.Ordubadi. *Xəlilin üzündəki təbəssüm izləri silinib getdi.* M.Hüseyn. *Analar mübariz sıraya dursun; Dünyadan qan izi kəsilsin deyə.* N.Rəfibəyli.

3. Yol. [Hafizə xanım Qurbana:] *Yolundan, izindən azma!* Ə.Haqverdiyev. [İblis:] *Hakim o sənin hissinə, idrakinə .. əfsus! Ayrılsan izindən olur əğyar ilə mənus.* H.Cavid.

◊ **İz açmaq, iz buraxmaq** – 1) yeri qalmaq, özündən sonra əlaməti qalmaq. *Amma o, yenə də daş kimi hərəkətsiz qaldı. Birdən üçüncü qamçı alnında qara bir iz buraxdı.* M.Hüseyn. *Qan* [Cavadın] *keçə çəkməsindən axaraq qar üzərində iz buraxırdı.* Ə.Vəliyev. *Alnında izlər açdı əzabları xış kimi; İnlədi çöldə bitən yaralı qamış kimi.* B.Vahabzadə; 2) dərin təsir etmək, dərin intiba buraxmaq. [Yaralı zabit:] *Hələ sən, ah, sən! Sənin kədərin; Məndə bir iz buraxdı xeyli dərin.* H.Cavid. *Qızla anası arasında olan bugünkü söhbət Dilbərin xatirində dərin iz buraxdı.* Ə.Sadıq. **İz azdırmaq** – 1) əsas məsələdən, mətləbdən, fikirdən yayındırmaq, uzaqlaşdırmaq. *Qorxmazın izahatından sonra Saleh öz-özünə bu cür nəticə çıxartdı: – Əvvəlki suallar, nə təhər deyirlər, iz azdırmaq üçün imiş, əsil mətləb axırıncısıdır?* Ə.Vəliyev; 2) bax **iz itirmək**. **İz itirmək, izi itirmək** – bir cinayətin, hadisənin, işin üstü açılmamaq üçün əlamət və nişanələrini yox etmək, ört-basdır eləmək, gizlətmək. *Buna görə də əhali öz qorxusundan küçədəki meyitləri toplayıb quyulara tökməklə izi itirmək istəmişlər.* M.S.Ordubadi. **İz izləmək** – izini axtarmaq. *Çıxım gədiklərdən, izin izləyim; Ucalardan alçaqları gözləyim.* "Koroğlu". **İzə düşmək** – yoluna düşmək, yolunu tapmaq. *Çıxıbdır düzə ceyran; Düşübdür izə ceyran; Çox tərlan ovlamışam; Görünmür gözə ceyran.* (Bayatı). **İzi itirilmək** – yox edilmək, məhv edilmək, əlli-ayaqlı itirilmək. *Camaatın halına ağlayan, onun dərdinə dərman axtaranların nəsli kəsilir, izi itirilirdi.* H.Sarabski. **İzinə düşmək** – bir şeyin olduğu yeri öyrənib bilmək, bir şeyin bu və ya digər yerdə olduğunu təsdiq edən məlumat əldə edərək,

onun dalısınca getmək. *Müqim bəy izinə düşdüyü işi açmamış, .. heç zaman məsələni örtülü qoyub əl götürmək istəmirdi.* S.Rəhimov. [Qurd Kərim:] *Zindandan qaçmışam bu dağlara mən; İzimə düşərək tutdular məni.* S.Rüstəm. [Ovçunu] [dağlara] *aşağıdan qalın aran meşələrində izinə düşdüyü bir maral çəkib gətirmişdi.* Ə.Məmmədxanlı. **İzini azdırmaq** – b a x **iz azdırmaq**. *..Ola bilsin ki, .. izləyən var. Yəqin izini azdırmaq istəyir.* Ə.Məmmədxanlı. **İzini itirmək** – 1) b a x **izi itirmək**; 2) qəsdən çaşdırmaq, sapdırmaq, izini azdırmaq. **İzini tutmaq** – izi ilə getmək, təqib etmək. [Pəridux xanım] *atın ləpirinin izini tutub, birbaş gəlib çıxdı çarhovuzun qırağına.* (Nağıl). *Uşaqlar izi tutub getməyə başladılar.* İ.Əfəndiyev. **Nə izi var, nə tozu** – varlığına dəlalət edən heç bir əsər, heç bir əlamət, heç bir nişan yoxdur.

**İZAFƏ** b a x **izafi**. *Mən şairin evinə xəbər vermədən getmişdim, çünki ona izafə xərc vermək istəməmişdim.* M.S.Ordubadi. [Məhərrəm bəy:] *Bəli, bir çox bu kimi izafə xərclər aramızda adət olmuşdur.* S.S.Axundov.

**İZAFƏT** *is.* [*ər.*] *dilç.* Təyini söz birləşməsi.

**İZAFİ** *sif.* [*ər.*] Artıq, əlavə. *İzafi xərc. İzafi söz.* – [Mirzə Salman:] *Amma hər birisinə yarım milyondan artıq izafi xərc eləmişik.* S.Rəhimov.

◊ **İzafi dəyər** *iqt.* – muzdlu fəhlənin əməyi ilə onun öz iş qüvvəsinin dəyərindən artıq yaradılan və kapitalist tərəfindən havayı mənimsənilən dəyər.

**İZAH** *is.* [*ər.*] Bir fikri, əsəri və s.-ni yazılı və ya şifahi şəkildə aydınlaşdırma, anlatma, şərh etmə, bəyan etmə; şərh, bəyan. [Arif:] *Artıq yetişir, anladım, izahə nə hacət; Qarşımdakı İblis imiş, eyvah, nə dəhşət!* H.Cavid. *İndi daha Fatmanın nə suala, .. nə də Sadıq kişinin izahına ehtiyacı qalmışdı.* Mir Cəlal. [Rəşid dedi:] *..Dediyim sirrin izahı məhz həmin gündən başlandı.* İ.Hüseynov. ☐ **İzah etmək** – anlatmaq, şərh etmək, açmaq, bəyan etmək. *Məsələni izah etmək. Kitabın çətin yerlərini izah etmək. – Komissar hadisəni izah etdi.* M.Rzaquluzadə.

**İZAHAT** *is.* [*ər.* "izah" söz. cəmi] Bir məsələni, sözü və s.-ni ətraflı surətdə aydınlaşdırma, şərh etmə, bəyan etmə; müfəssəl izah. *İzahata ehtiyac yoxdur. – Bütün bu yuxarıdakı izahat bizi inandırır ki, cənab Şirvanski "Vətən dili" kitabına qiymət verərkən zəhmət çəkib onun məzmunu ilə lazımi qədər tanış olmamış...* F.Köçərli. *Qulam müəllim artıq bir izahata girişmək istəmədi.* S.Rəhimov. // Bir işin, hərəkətin, hadisənin və s.-nin səbəblərini izah edən yazılı məlumat. *Hadisə haqqında izahat təqdim etmək.* ☐ **İzahat vermək** – şifahi və ya yazılı surətdə ətraflı şərh etmək, aydınlaşdırmaq, məlumat vermək. *Hacı Manaf izahat verməyə başladı..* S.Hüseyn. *Başqa bir otağa girdilər, müdir izahat verərək dedi: – Bu qızlar məzhəkəçilik və nədimlik öyrənmiş qızlardır.* M.S.Ordubadi. *Eldar sözə qarışıb, onun dediklərini təsdiq etdi və mənə izahat verdi..* M.Rzaquluzadə.

**İZAHATÇI** b a x **izahçı**.

**İZAHATÇILIQ** b a x **izahçılıq**.

**İZAHÇI** *is.* 1. Muzeylərdə, sərgilərdə və s.-də baxmaq üçün qoyulmuş şeylər haqqında gələnlərə məlumat verən işçi.

2. Təfsirçi, şərhçi.

**İZAHÇILIQ** *is.* İzahçının işi, vəzifəsi.

**İZAHEDİCİ** *sif.* Aydınlaşdıran, izah edən, şərh edən, izahat mahiyyətində olan. *İzahedici məlumat. – Ancaq verdiyim izahedici suallara Ağarəhim çox qəşəng cavablar verdi.* S.Rəhman.

**İZAHEDİLMƏZ** *sif.* İzah edilə bilməyən, anlaşılmaz, müəmmalı, qəribə. *İzahedilməz hərəkət. İzahedilməz hiss.*

**İZAHLI** *sif.* Sözləri izah edən, onların mənalarını açan. *İzahlı lüğət. İzahlı mətn.*

**İZAHSIZ** *sif.* İzahı, şərhi olmayan, izahı verilməmiş. *İzahsız mətn. İzahsız lüğət.*

**İZAXTARAN** b a x **iztapan**.

**İZAL** [*ər.*]: **izal(ə) olmaq** *nifr.* – rədd olmaq, çəkilib getmək. *Cəbi qapını açıb mayora dedi: – Ağa, izal olun!* N.Vəzirov. [Əli dayı:] [Şah] *izalə olur, ancaq bizim arxalandığımız sərbazları da özü ilə aparır.* P.Makulu.

**İZÇİ** b a x **iztapan**. // Bir şeyin izinə düşüb axtaran.

**İZDİHAM** *is.* [*ər.*] Bir yerə çoxlu camaat yığılması, çox qələbəlik, böyük camaat kütləsi. *Cümə günü olduğu üçün hər tərəfdə böyük bir izdiham vardı.* S.Hüseyn. *Körpüdə izdiham çox idi..* T.Ş.Simurq. *Adamın ucu-bucağı yox idi, izdiham sel kimi axırdı.* C.Cabbarlı. // Çoxlu adam yığılmış yer, tünlük, basırıq, qələbəlik. *Sabahdan Mehdi bəyin evində böyük izdiham var idi. Çünki Şəban Gülsümü onun evinə gətirmişdi.* Ə.Haqverdiyev.

**İZDİHAMLI** *sif.* Qələbəlik, tünlük, basırıq, çoxlu adam olan. *İzdihamlı yer. İzdihamlı mitinq.* – [Ceyran:] *..İzdihamlı şəhər küçələrində səndən qaçmağım qorxudan deyildi.* S.Hüseyn. *Arvad nədir, belə izdihamlı yer nədir?* T.Ş.Simurq. *Yunis həyət qapısından şəhərin geniş, izdihamlı küçələrinə çıxdı.* Mir Cəlal.

**İZDİHAMLILIQ** *is.* Çoxlu adam olan, qələbəlik yerin halı; gurultululuq.

**İZDİVAC** *is.* [*ər.*] *kit. köhn.* Evlənmə. *Bu izdivac hər iki tərəfin əqidəsincə faydalı idi.* Ə.Haqverdiyev. *Şəmsiyyə ilə Səliminin izdivacı* [Həkimülmülkə] *siyasi cəhətdən də lazım idi.* M.İbrahimov. ☐ **İzdivac etmək** *kit. köhn.* – evlənmək.

**İZ-ƏLAMƏT** b a x **iz** 2-ci mənada. ☐ **İz(i)-əlamət(i) qalmamaq (olmamaq, görünməmək)** – varlığına dəlalət edən heç bir şey, heç bir əlamət, heç bir nişanə qalmamaq. [Leylək Ələmdar] *ağası ilə birlikdə bütün həyəti, bağçanı bir-birinə vurdu, ancaq Alagözdən heç bir iz-əlamət görünmədi.* S.Rəhimov. // Yox olmaq, məhv olmaq, ortadan silinib getmək.

**İZ-ƏSƏR** b a x **iz-əlamət**. ☐ **İz(i)-əsər(i) qalmamaq (olmamaq, görünməmək)** – b a x **izi-əlaməti qalmamaq (olmamaq, görünməmək)** (“**iz-əlamət**”də).

**İZHAR** [*ər.*] 1. Aşkar etmə, meydana çıxarma, göstərmə, bəlli etmə, bildirmə. // Bəlli, aydın, məlum. *Bir gülüzlü nigar, sərvi-xoşrəftar; Cümlə xalqa izhar, bəllidi adı.* Aşıq Saleh. ☐ **İzhar etmək (eləmək, qılmaq)** – zahirə çıxarmaq, aşkar etmək, açmaq, bəlli etmək, bildirmək. *Kimə kim, dərdimi izhar qıldım, istəyib dərman; Özümdən həm bətər bir dərdə onu mübtəla gördüm.* Füzuli. *Qorxudan başımıza gələn macəranı heç kəsə izhar eləmədik.* C.Məmmədquluzadə. *Necə hər gizlini mən eyləyib izhar, yazım; Qorxmayıb Qaxqulu bəydən elə təkrar yazım?* Ə.Nəzmi.

2. *köhn.* Bir sıra birləşmələrin birinci tərkib hissəsi; məs.: izhari-nifrət, izhari-təəssüf, izhari-təşəkkür və s. *Budur qonşularımızın hal həyatda olan şair və ədibləri haqqında etdiyi izhari-məhəbbət və müvəffəqiyyət və izhari-sədaqət və xülusiyyət!* F.Köçərli. [Mürtəcelər] *fikirsiz və mütaliəsiz qiyam barəsində izhari-nəzər edib, öz keçəcəklərini unudublar.* M.İbrahimov. ☐ **İzhari-nifrət etmək (bildirmək)** *köhn.* – öz nifrətini izhar etmək, bildirmək. [Məşədi İbad:] *Bax, elə yaz ki, xalq oxuyub Rüstəm bəyə izhari-nifrət eləsin.* Ü.Hacıbəyov. **İzhari-təəssüf etmək** *köhn.* – öz təəssüfünü bildirmək. **İzhari-təşəkkür etmək** – öz təşəkkürünü bildirmək. *Məcmuəmizin açılmağı barəsində .. teleqram və məktub göndərənlərdən nəhayət dərəcədə məmnun olub, bizi yada salanlara izhari-təşəkkür edirik.* “Mol. Nəsr.”

**İZİN** *is.* [*ər.*] İcazə, rüsxət. *İzin istəmək. İzin vermək. – Ələsgərəm, eşq oduna qalannam; İzin versən, yar, başına dolannam.* Aşıq Ələsgər. *İki ay bundan qabaq naçalnikdən izin alıb getmişdim kəndimizə anamın ziyarətinə.* C.Məmmədquluzadə. *Aman bacım, izin ver, gedim, görüm mən onu; Könlümün ilk dostunu.* B.Vahabzadə.

**İZİNCƏ** *zərf* İzi ilə, ardınca, arxasınca, təqib edərək. *Birinin izincə getmək. – Vahid bələd adam kimi dala baxmadan, atası da onun izincə yüyürdü.* Mir Cəlal.

**İZİNLİ** *sif.* 1. İcazəli, icazəsi olan, icazə (izin) almış, rüsxətli.

2. İcazə verilən, izin verilən, yol verilən.

**İZİNSİZ** *zərf* İcazəsiz, icazə olmadan, icazə verilmədən. *Bəzi vaxt atasından və qardaşından izinsiz yadların toylarına anası öz qızını göndərərdi.* R.Əfəndiyev. [Qulu:] *Özün buyurubsan ki, izinsiz sənin otağına girməyim.* S.S.Axundov. *Verdiyev vacib iş üçün gələn tövr ilə izinsiz içəri girdi.* Mir Cəlal.

**İZLƏMƏ** “İzləmək”dən *f.is.*

**İZLƏMƏK** *f.* 1. Birinin izi ilə, ardınca getmək, təqib etmək, izinə düşmək. – [Xəyyam:] *Yox, oxşayacaq ruhumu bir zərrə səadət; İzlər məni hər dürlü fəlakət.* H.Cavid. *Sarıbəniz uşaqlar həyəcanla bu məhbusları izləyirdilər.* S.Vəliyev. *Mən inamla irəliləyən Rəşidi addım-addım izləyirdim.* M.Rzaquluzadə.. // İzinə düşüb axtarmaq, aramaq. *Oğrunu izləmək. – Böyük bir mahalın divanı yerindən tərpənib Nəbini izləməyə başlamışdı.* S.Rəhimov. // Göz qoymaq, güdmək. *Üstü örtülü səbətlərdən şübhələnmiş polis xəfiyyəsi, uzaqdan-uzağa Qulam dayını izləyirdi.* M.Hüseyn. *Maya daha diqqətlə ərini izləyərək, onda başqa bir qadın iyini duyduqda sarsılmışdı.* M.İbrahimov. [Teymur Zərifəyə deyir:] *Biz illər uzunu sənin həyatınla maraqlanmış, hər addımını izləmişik.* H.Seyidbəyli.

2. *məc.* Birinin yolu ilə getmək, onun yolunu davam etdirmək, dalınca getmək. *Bir dramaturq olaraq* [Ü.Hacıbəyov] *məhz M.F.Axundov və C.Məmmədquluzadənin dramaturji üslubunu izləyərək .. misli görünməmiş komediyalar yazmışdır.* Ə.Sultanlı.

3. *məc.* Təqib etmək, göz qoymaq, müntəzəm tanış olmaq. *Gündəlik mətbuatı izləmək. – Firidun .. diqqətlə qəzetləri izləyirdi.* M.İbrahimov.

**İZLƏNMƏ** "İzlənmək"dən *f.is.*

**İZLƏNMƏK** *məch.* Təqib olunmaq. .. *Polis idarəsi tərəfindən izləndiyini və ələ düşəcəyini görüb ailəsi ilə bərabər İspaniyaya köçdü.* S.Vəliyev.

**İZLƏTDİRMƏ** "İzlətdirmək"dən *f.is.*

**İZLƏTDİRMƏK** b a x **izlətmək**.

**İZLƏTMƏK** *icb.* İzi ilə tapdırmaq.

**İZOXƏT** *is.* [*yun.* isos və *ər.* xətt] *geofiz.* Coğrafiya xəritəsində: müəyyən fiziki kəmiyyət (təzyiq, temperatur, rütubətlilik və s.) göstəricisi olan yerləri birləşdirən xətt.

**İZOLƏ: izolə etmək** *tex.* – hər hansı elektrik məftilinin üstünü müxtəlif vasitələrlə örtmək yolu ilə bunları xarici mühit ilə təmasdan qorumaq. *Elektrik məftilini izolə etmək. Kabeli izolə etmək.*

**İZOLƏEDİCİ** *sif. tex.* İzolyasiya edən, ayıran, izolyator. *İzoləedici materiallar.*

**İZOLYÁSİYA** [*fr.*] *tex.* 1. İzolə edən material; izolə edən qurğu, cihaz və s. *İzolyasiya materialları. – Sarınmış naqillərin izolyasiyaları pambıq, iplik, ipək, .. şüşə və s. materiallardan hazırlanır.* P.Rüstəmzadə.

2. B a x **izolə**.

**İZOLYASİYALI** *sif. tex.* İzolyasiyası olan. *İzolyasiyalı məftil.*

**İZOLYÁTOR** [*fr.*] 1. *elektr.* Elektrik keçirməyən material, maddə. *İzolyator zavodu.*

2. *elektr.* Elektrik məftillərini bənd və izolə etmək üçün rolik, fincan. *Yüksək voltlu izolyator. Asma izolyator.*

3. *tib.* Yoluxucu xəstəliyi olan xəstələri və dəliləri saxlamaq üçün xüsusi otaq, bina (xəstəxanada və s.-də).

**İZOMERLƏR** [*yun.*] *kim.* Kimyəvi tərkibi və molekulyar çəkisi eyni, lakin fiziki və kimyəvi xassələri isə başqa-başqa olan kimyəvi birləşmələr. *Bu kimi eyni tərkibə malik müxtəlif xassəli və müxtəlif quruluşlu maddələrə izomer maddələr deyilir.* M.Mövsümzadə.

**İZOTOPLAR** [*yun.*] *xüs.* Eyni kimyəvi element atomlarının radioaktivliyə və atom çəkisinə görə bir-birindən fərqlənən formaları. *Radioaktiv izotoplar. Uran izotopları. – Alimlər radioaktiv izotopların köməyi ilə pambıqdan müxtəlif parçalar almaq üçün səmərəli üsullar hazırlamışlar.* (Qəzetlərdən).

**İZSİZ** 1. *sif.* İzi olmayan; heç bir iz, nişanə, əlamət, əsər qalmamış. *İzsiz yol. – Keçib izsiz yerlərdən; Apara billəm xəbər.* M.Seyidzadə.

2. *zərf* Heç bir iz buraxmadan, özündən sonra heç bir iz qoymadan. *İzsiz yox olmaq. Heç bir şey izsiz keçib gedə bilməz.*

**İZSİZ-SORAQSIZ** b a x **izsiz** 1-ci mənada.

**İZSİZ-TOZSUZ** b a x **izsiz-soraqsız**.

**İZTANIYAN, İZTAPAN** *is.* və *sif.* Yaxşı iz tanıyan, iz ilə tapan; ləpirçi, izçi. *İztapan ovçu. İztapan kəşfiyyatçı. İztapan tula. – Tülkü və xüsusən qurd ovuna çıxarkən, ovçu soyuqqanlı və cürətli, mahir iztapan olmalıdır.* M.Rzaquluzadə.

**İZTİRAB** *is.* [*ər.*] Təlaş, təşviş, daxili həyəcan, narahatlıq, mənəvi əziyyət, nigarançılıq. *Böylə əldən getdiyim gər bilsə yar əldən gedər; İztirabım görsə bəhri-bikənar əldən gedər.* Qövsi. [Arif Xavərə:] *Sorma,*

*heç sorma, nazənin Xavər! Məni məhv etdi iztirabü kədər.* H.Cavid. [Mehribanın] *qəlbinin iztirablarını ovunduracaq bir arxadaşa nə qədər ehtiyacı vardı.* S.Hüseyn. ◻ **İztirab etmək** – həyəcanlanmaq, narahat olmaq, təşviş etmək. *Etmə, canım, iztirab; Tələsmə, çox ertədir.* A.Səhhət. **İztirab keçirmək (çəkmək)** – mənəvi əzab çəkmək, həyəcan keçirmək, narahatlıq içində olmaq. *..Simasından onun hirs, əsəbilik və dərin bir iztirab keçirdiyini görmək olardı.* S.Rəhimov. *Yaxın günlərdə buraya* [kameraya] *atılan Qədir hamıdan artıq iztirab çəkirdi.* Mir Cəlal. **İztirab vermək** – b a x **iztiraba salmaq**. *Məni hərdəm yada sal, qadan alım; Rəhm elə, yar, vermə bunca iztirab.* "Abbas və Gülgəz". **İztiraba düşmək** – təşvişə düşmək, həyəcana düşmək, əsəbiləşmək, narahat olmaq. *Xubani-hərəm gördülər ki, bir qəribə iş üz verdi, çox xof və iztiraba düşdülər.* M.F.Axundzadə. *İndi neçə saat idi ki, əri getmişdi. Gec gəldiyindən arvad iztiraba düşüb vurnuxurdu.* Ə.Haqverdiyev. **İztiraba salmaq** – təşvişə salmaq, narahat etmək. *Bu isə məni iztiraba salırdı.* S.S.Axundov.

**İZTİRABLI** *sif.* Təşvişli, həyəcanlı, əzablı, əziyyətli, ağır; əzab və əziyyətlə dolu. *İztirablı günlər keçdi. – Xalıqverdi iztirablı və intizarlı dəqiqələr keçirir, nigarançılığı hər an artırdı.* Ə.Vəliyev. *Leyla dəri yumağını coşqun bir hərəkətlə köksünə basıb, iztirablı bir intizar içərisində dayandı.* Ə.Məmmədxanlı.

**İZ-TOZ** b a x **iz** 2-ci mənada. [Yasəmən:] *Yadınızdadırmı, biz oxuyanda bunların heç izi-tozu da yox idi.* S.Rəhman. ◻ **İzi-tozu qalmamaq (olmamaq, görünməmək)** – b a x **iz(i)-əlamət(i) qalmamaq** ("**iz-əlamət**"də). [Fatma xala:] *Deyirlər əfəndi deyib ki, bu yaxında* [Allah] *bu yəcuc-məcuca bir toy tutsun ki, bunların heç izi-tozu qalmasın.* Ə.Əbülhəsən. **İzini-tozunu itirmək** – 1) bir şeydən, hadisədən heç bir iz qoymamaq, heç bir əsər-əlamət qoymamaq, tamamilə yox etmək, yoxa çıxarmaq. *Bir adam ki ağasının Məkkə qurşağını boğazına dolaya, gecənin qaranlığında onun izini-tozunu itirə, var-yoxunu sil-süpür eləyə, .. daha nə üçün vəziyyətindən razı olmazdı.* S.Rəhimov; 2) bir cinayətin, işin üstü açılmamaq üçün onu ört-basdır etmək; izini itirmək.

**İZZƏT** *is.* [*ər.*] Hörmət, şərəf, etibar. *Arvadın isməti – ərin izzəti.* (Ata. sözü). *Gər çox istərsən, Füzuli, izzətin, az et sözü; Kim çox olmaqdan qılıbdır çox əzizi xar söz.* Füzuli. *Nəbati istəməz sənsiz dünyanı; İzzəti, hörməti, şövkəti, şanı.* Nəbati. [Teymur ağa:] *Məyər xan ona verdiyi ixtiyar və izzət bəs deyil?* M.F.Axundzadə. [İmran:] *..Bunlar hansı dağı qoyub dağ üstə; Neçindir bu hörmət, izzət onlara!* B.Vahabzadə.

**İZZƏTİ-NƏFS** *is.* Heysiyyət, mənlik hissi, şərəf. *İzzəti-nəfsini qorumaq. İzzəti-nəfsinə toxunmaq. – Qadınlarda şərəf və izzəti-nəfs daha yüksəkdir.* M.S.Ordubadi. *Ayrım qızı .. naxır sahiblərinin töhmət və məzəmmətlərini izzəti-nəfsinə sığışdıra bilmədiyindən Kərim babanın arxasınca hər gün söylənərdi.* A.Şaiq. *Mənim bu sifarişim nə qədər səmimi olsa da, yenə də Fərhad bəyin izzəti-nəfsinə toxunmuşdu.* Qantəmir.

**İZZƏTİ-ŞƏRƏF** *is.* Hörmət, şərəf, etibar, yüksəklik. *Ailənin izzəti-şərəfini qorumaq.*

**İZZƏTLİ** *sif.* Hörmətli, şərəfli, əziz, izzət sahibi.

# Jj

**J** Azərbaycan əlifbasının on beşinci hərfi. bax **je**.

**JAKÉT** *is.* [*fr.*] Qısa qadın üst paltarı. *Jaket geymək. Jaket isti saxlayır. – Jaketinin altından yaxalığı salınmadan geydiyi köynəyin yaxası nəzəri-diqqəti cəlb edirdi.* S.Hüseyn. [Firuzə] *əlini dirsəkdən ilməsi qaçmış sarımtıl, nimdaş jaketinin cibinə saldı.* İ.Məlikzadə. *Əynindəki zolaqlı qırmızı jaket* [Şahnazın] *köksünü sıxırdı.* İ.Şıxlı.

**JALƏ** *is.* [*fars.*] 1. Şeh, şəbnəm. *Güldü gül, açıldı nərgiz, lalə doldu jalədən.* Füzuli. *Bitir çəməndə lalələr, əlində al piyalələr; Səhər zamanı dür kimi düşər ot üstə jalələr.* A.Səhhət. *Səhər zamaniydi, əsərkən yellər; Düşərkən jalələr oyatdı səni.* Ə.Cavad.

2. *məc.* Göz yaşı mənasında. *Çün gəldi özünə, qıldı nalə; Yağdırdı xəzanı üzrə jalə.* Füzuli. *Zaman silər ürəklərdən naləni; El unudar göz yaşını, jaləni.* S.Rüstəm.

**JALÜZ** *is.* [*fr.*] Nazik materiallardan qayrılan qat-qat pəncərə pərdəsi.

**JANDÁRM(A)** *is.* [*fr.*] 1. Jandarmeriyada xidmət edən polis məmuru. *..Əziz bəy jandarma gücü ilə bizi əsir kimi dübarə Hacıxoşoya qaytarıb..* C.Məmmədquluzadə. [Birinci işçi:] *Nikolay taxta çıxıb gəlsə yarın; Ona jandarma olurdun..* H.Cavid. *Jandarm zabitinin qan beyninə vurdu.* M.Hüseyn.

**JANDARMALIQ** bax **jandarmeriya**.

**JANDARMÉRİYA** [*fr.*] Çar Rusiyasında və burjuaziya ölkələrində siyasi mühafizə və inqilabi hərəkata qarşı mübarizə üçün xüsusi polis qoşunları. *Bu adam .. çar jandarmeriyasından böyük bir mükafat deyil, ağır bir cəza alacaqdır.* M.S.Ordubadi.

**JANR** [*fr.*] 1. İncəsənətin hər hansı bir sahəsində süjet və üslub cəhətdən səciyyəvi olan əsərlər növü. *Roman janrı. Epik janr.* // Məişət mövzusunda çəkilən şəkil. *Sərgidə nümayiş etdirilən əsərlər janr və mövzu etibarilə rəngarəngdir.* (Qəzetlərdən).

3. Üslub, tərə. *Janr, musiqi sənətində ümumi əlamətlər əsasında toplanmış əsərlərin formasına deyilir.* Ə.Bədəlbəyli.

**JANRÍST** [*fr.* genre-dən] Məişət mövzusunda şəkillər çəkən rəssam.

**JARQÓN** [*fr.*] *dilç.* Ümumxalq dilindən ayrılan və öz spesifik söz və ifadələri ilə ondan fərqlənən müəyyən ictimai və ya peşəkar qrupunun danışdığı dil. // Yalnız müəyyən ictimai qrup içərisində başa düşülən şərti dil.

**JE** "J" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**JELATÍN** [*fr.*] Məhlulu soyudulduqda həlməşik hala keçən üzvi zülali maddə (texnikada, fotoqrafiyada, təbiətdə və s.-də işlənir).

**JELATİNLƏŞDİRİLMƏ** "Jelatinləşdirilmək"dən *f.is.*

**JELATİNLƏŞDİRİLMƏK** *məch. kim.* Üzvi zülali maddənin məhlulunu soyutmaqla həlməşik halına salınmaq.

**JELATİNLƏŞMƏ** "Jelatinləşmək"dən *f.is.*

**JELATİNLƏŞMƏK** *f. kim.* Üzvi zülali maddənin məhlulu soyuyaraq həlməşik halına düşmək.

**JELE** *is.* [*fr.*] Meyvə şirələrindən hazırlanan həlməşik desert yeməyi.

**JELONKÁ** *is. köhn.* [*rus*] Keçmişdə: quyulardan neft çıxarmaq üçün işlədilən vedrəyə oxşayan uzunsov qab. *Nefti quyudan jelonka deyilən iri dəmir qablarla çıxarırlar.* A.Şaiq. [Fəhlələr:] *Ağa, jelonka düşdü quyunun içinə.* A.Səhhət.

**JELONKAÇI** *is. köhn.* Keçmişdə jelonka ilə quyudan neft çəkən fəhlə.

**JELONKAÇILIQ** *is. köhn.* Jelonka ilə quyudan neft çəkən fəhlənin işi, peşəsi.

**JENŞÉN** [*çin.*] *bot.* Uzaq Şərqdə bitən və kökündən təbabətdə istifadə edilən ot bitkisi. *Vətəni Uzaq Şərq olan jenşen bitkisinin kötüyündə qiymətli dərman maddəsi olur.*

**JEST** [*fr.*] 1. Əl-qol hərəkəti.

2. *məc.* Nəzərə çarpdırmaq üçün görülən iş, edilən hərəkət.

**JETÓN** [*fr.*] 1. Metal nişan; medal.

2. Metal marka. *Kassadan alınan çeki – dəmir jetonu avtomata salmaq lazımdır.*

**JİLÉT** [*fr.*] Pencək və s. altından geyilən qısa, qolsuz və yaxasız geyim. *Hər kəs yaxalığını, vizitkasının ətəklərini, jiletinin düymələrini sahmanladı.* M.S.Ordubadi. *Teymur*

*müəllim balaca, arıq bir kişi idi. Əyninə köhnə modalı məxmər jilet geyər, başına araqçın qoyardı.* Ə.Sadıq.

**JİLETKÁ** b a x **jilet**. *Rzaqulu xan bütün əlbisəsini töküb, şiddəti-hərarətdən fəqət bir jiletka ilə oturub, İran kəndlilərinin üryanlığını təsvir edirdi.* M.S.Ordubadi.

**JİLETLİ** *sif.* 1. Jileti olan. *Jiletli kostyum.*

2. Jilet geymiş, əynində jilet olan. *Jiletli kişi.*

**JİLETLİK** *sif.* Jilet üçün yarayan.

**JİRÓ** *is.* [*ital.*] 1. Nağd olmayan hesab növü.

2. Həvalə qeydi, indossament.

**JİRONDÁ** [*fr.*] *tar.* XVIII əsrdə Fransa burjua inqilabı dövründə iri burjuaziyanın mənafeyini əks etdirən və əksinqilab tərəfinə keçmiş olan siyasi qruplaşma [Fransanın Jironda (Dironde) departamentinin adından].

**JİRONDİST** [*fr.* Dironde-dən] *tar.* Jironda partiyasının üzvü, jironda tərəfdarı.

**JİROVKÁ** [*rus. ital.* giro-dan] *mal.* Qarşılıqlı borcun ödənilməsi haqqında haqq-hesab əməliyyatı və bu əməliyyat üçün əsas olan sənəd.

**JİTİYE** *is.* [*rus.*] Müqəddəslərin tərcümeyi-halı.

**JMIX** *is.* [*rus.*] Yağlı bitkilərin yağı çıxarılmış toxumlarının qalığı. *Jmıx unu* (üyüdülmüş, un halına salınmış jmıx). – *Çiyidin yağı çıxarıldıqdan sonra yerdə qalan maddədən hazırlanan jmıxda 40-43% zülali maddə və müəyyən miqdarda yağ olduğundan heyvanlar üçün çox yaxşı yemdir.* M.Qasımov.

**JMIXDOĞRAYAN** *sif.* və *is. k.t.* Jmıxı doğrayıb xırdalayan (maşın).

**JOKÉY** [*ing.*] Cıdırda, çapışmada peşəkar sürücü, minici. *İstəyir ki, belindəki; Yarışlarda nəmər alan jokey deyil; Vuruşlarda zəfər çalan igid olsun!* B.Vahabzadə.

**JONQLYÓR** [*fr.*] Əlləri ilə bir neçə şeyi məharətlə atıb-tutan sirk artisti.

**JONQLYORLUQ** *is.* 1. Jonqlyorun (sirk artistinin) işi, peşəsi.

2 *məc.* Hoqqabazlıq. *Jonqlyorluq etmək.*

**JÚLİK** [*rus.*] Xəspuş, cibgir, oğru; fırıldaqçı. [Həsən:] *Adlarını ağa qoyublar, hamısı julikdirlər, julik!..* Ə.Haqverdiyev. *Hanı o .. dükançı Hüseyn? Ədə, o yaman julik, yaman adam..* A.Şaiq. [Nemətullayev:] *Hərçənd siz* [Qiyasəddin] *biz kooperatoru kişi hesab eləmirsiniz, ancaq biz də kişiyik, biz julik deyilik.* S.Rəhimov. *Çıxdı səd heyf, əlimizdən ol ədalət kani; O juliklər yatağı, köhnə Quba meydani.* Ə.Vahid.

**JULİKLİK** *is.* Xəspuşluq, cibgirlik, fırıldaqçılıq.

**JURNÁL** [*fr.* journal] 1. Kitabça şəklində nəşr edilən dövri məcmuə. *Aylıq jurnal. Tibb jurnalı. Moda jurnalı. Ədəbiyyat jurnalı.* – *Bu axır vaxtlarda müsəlman qəzetləri və müsəlman jurnalları övrətlərimizə dair bir para məqalələr yazıblar.* C.Məmmədquluzadə. *Masanın üstündə gözlük, qələmdan; Qəzetlər, jurnallar, cild-cild kitablar.* B.Vahabzadə.

2. Hadisələri və s.-ni müntəzəm surətdə qeyd etmək üçün dəftər, ya kitab. *Məktəb jurnalı. Növbə jurnalı.* – *Müəllim jurnalını götürüb getdi, biz də kitablarımızı sinifdə buraxıb küçəyə çıxdıq.* T.Ş.Simurq.

**JURNALÍST** [*fr.* journal-dan] Jurnalistika ilə məşğul olan peşəkar ədəbi işçi. *Azərbaycan milli operasının banisi Üzeyir Hacıbəyov eyni zamanda məşhur bir jurnalist olmuşdur.* – *Azərbaycan mətbuatı tarixində* [C.Məmmədquluzadə] *böyük və istedadlı bir jurnalistdir.* M.İbrahimov.

**JURNALİSTÍK** b a x **jurnalistlik**.

**JURNALÍSTİKA** [*fr.* journal-dan] 1. Jurnallarda, qəzetlərdə ədəbi-publisistik fəaliyyət. *Jurnalistika ilə məşğul olmaq.* – *"Molla Nəsrəddin" birinci olaraq bizdə satirik xarakter daşıyan jurnalistika məktəbi yaratmışdır.* M.İbrahimov.

2. *top.* Dövri nəşrlərin məcmusu. *Azərbaycan jurnalistikası.*

**JURNALİSTLİK** *is.* Jurnalistika ilə məşğul olma, jurnalistin işi, peşəsi. *C.Məmmədquluzadənin 40 ilə yaxın ədəbi və 20 ildən artıq davam edən jurnalistlik fəaliyyəti "imperializm və proletar inqilabları" dövrünə təsadüf edir.* M.İbrahimov.

**JÜRÍ** [*fr.* jury] Konkurslarda, yarışlarda, sərgilərdə və s.-də mükafat təyin edən mütəxəssislər heyəti; hakəm. [Kamil:] *..Mən jürinin üzvüyəm, konkursda iştirak edə bilmərəm.* M.Süleymanov. [Qurban Pirimov] *respublikanın bir çox olimpiadalarında jüri heyətinin üzvü olmuşdur.* Ə.Bədəlbəyli.

# Kk

**K** Azərbaycan əlifbasının on altıncı hərfi. bax **ke.**

**KABAB** *is.* [*ər.*] Köz üstündə şişdə, yaxud od üzərində tavada doğranmış ətdən, balıqdan bişirilmiş xörək. *Kabab bişirmək. Kababa qonaq etmək. Kabab çəkmək* (tikə ətləri şişə keçirmək). – *Kababı köz öldürər; İgidi söz öldürər.* (Ata. sözü). *..Evin dalında Şaqqulu manqalın üstə kabab bişirirdi.* Çəmənzəminli. [Səmədin] *burnuna xoş, ağız sulandıran kabab iyi dəydi.* İ.Hüseynov.

◊ **Kabab etmək (ciyərini, ürəyini)** *klas. məc.* – yandırmaq, yaxmaq. *Odlara salıb fəraqət əhlin; Yaxub cigərin kabab edən eşq!* Xətayi. *Könül, uyma bivəfayə; Axır səni xarab eylər; Salıb eşqin atəşinə; Cigərini kabab eylər.* Q.Zakir. **Kabab olmaq (ürəyi** və s.) – od tutub yanmaq, alışıb-yanmaq. *Ürəyi kabab oldu. – Atəşi-eşqində dil kabab olmuş; Dolanır, çevrilir pərvanələnmiş.* M.V.Vidadi. *Füqəralar yanıbən zülm oduna oldu kəbab.* S.Ə.Şirvani. **Kababa dönmək** *məc.* – yanmaq, yaxılmaq. [Umud:] *Dilin də yoxdu? Qalx yuxarı. Əslidən soruş. Denən dədəmin ciyəri kababa dönüb.* İ.Məlikzadə.

**KABABÇI** *is.* Kababxanada işləyən adam. [Vəli:] *Yoxsa öz oynamağın barəsində kababçı Həsən kimi böyük bir tənqidçinin rəyini soruşmaq istəyirdin? Ə.Haqverdiyev.* // Sif. mənasında. *Kababçı dükanı.*

**KABABÇILIQ** *is.* Kababçı peşəsi. *Əhalinin bir qismi də xırda ticarətlə – çayçılıq, kababçılıq, həlimaşıçılıq, bəzzazlıqla məşğul olardı.* H.Sarabski.

**KABABÇİLOV** *is.* Xuruşu kabab olan çilov. *Təbrizdən yeni gələn bir tanış deyirmiş ki, Həsəni Təbrizdə gördüm, məni kababçilova qonaq etdi.* Qantəmir.

**KABABXANA** *is.* [*ər.* kəbab və *fars.* ...xanə] Kabab bişirilib satılan ictimai iaşə müəssisəsi. *Piri maşını gölün qırağındakı kababxananın qabağında saxladı.* İ.Məlikzadə.

**KABABLI** *sif.* Kabab olan, kababla yeyilən, yanında (içərisində) kababı olan. [Yarməmməd:] *Möhtərəm sədrin kabablı çörəkdən xoşu gəlir.* M.İbrahimov.

**KABABLIQ** *sif.* Kabab bişirmək üçün yarayan. *Kabablıq ət.* – [Qəmər:] *Əti kabablıq* (z.) *doğrayıb duzlayacaqsan.* S.S.Axundov. [Mirzə Qulam:] *Bizim bu oğlana bir dörd kilo kabablıq erkək əti ver!* Mir Cəlal.

**KABALİSTİKA** *is.* [*qədim yəhudi dilində – rəvayət*] 1. Mistik təsəvvürlər və mərasimlər.

2. *məc.* Anlaşılmaz, dolaşıq, müəmmalı.

**KABARDALI** *köhn.* bax **kabardin.** *Soyuq və boranlı bir gecədə məzkur abxazlının süd qardaşı kabardalı Səfər bəy ona qonaq olur.* F.Köçərli.

**KABARDİN** *is.* Kabarda-Balkariyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsubadam. *Kabardin dili. Kabardin ədəbiyyatı.*

**KABARDİNCƏ** *sif.* və *zərf* Kabardin dilində. *Kabardincə kitab. Kabardincə danışmaq.*

**KABARÉ** [*fr.*] Estradası olan restoran, kafe.

**KÁBEL** [*holl.*] Elektrik enerjisini, səs siqnallarını nəql etmək üçün üstü hermetik örtülü məftil. *Elektrik kabeli. Dəniz teleqraf kabeli. Telefon kabeli. Sualtı kabel.*

**KABİNÉT** [*fr.*] 1. Evdə zehni işlə məşğul olmaq üçün xüsusi otaq; iş otağı. *Advokat Əlabbas bəy kabinetində əyləşib çay içirdi.* Ə.Haqverdiyev. *Sərdar Rəşid .. kabineti boşaltdı.* M.S.Ordubadi.

2. İdarə və müəssisələrdə məsul şəxslərin məşğuliyyəti üçün ayrılmış otaq. *Direktorun kabineti. – Mən* [müdirin] *kabinetinə girəndə, şöbə müdirlərini toplayıb nə barədə isə danışırdı.* M.Hüseyn. *Birinci katibin kabinetindən eşidilən zil qışqırtı Səmədi diksindirdi.* İ.Hüseynov.

3. Kabinet üçün mebel komplekti. *Köhnə stildə kabinet.*

4. Xüsusi məşğələlər üçün müvafiq avadanlıqla təchiz edilmiş ayrıca otaq (məktəblərdə, elmi tədqiqat müəssisələrində və s.-də). *Fizika kabineti. Kimya kabineti. İdman kabineti.* // Xüsusi olaraq təchiz edilmiş müalicə otağı. *Rentgen kabineti. Tibb-kosmetika kabineti.*

5. Restoranlarda və əyləncə yerlərində ümumi zalda oturmaq istəməyənlər üçün ayrılmış xüsusi otaq. *Nişanlısının Nəsir bəyin oğlu ilə .. restorana girən görüb, o da daxil*

*oldu. Qulluqçudan bunların tutduğu kabineti bilib, gəlib qapını döydü. Ə.Haqverdiyev.*

6. Hökuməti təşkil edən nazirlər heyəti; hökumət. *Kabinetin dəyişməsi. Yeni kabinet. Kabinet böhranı.*

◊ **Kabinet adamı, alimi** və s. – həyat və praktika ilə canlı əlaqəsi olmayan adam, alim və s. haqqında. **Kabinet royalı** – kiçik royal.

**KABİNETÇİLİK** *is. isteh.* Canlı həyatdan uzaq düşmə; kabinetdə qapanıb real həyatdan xəbərsiz qalma, mücərrədliyə meyil; nəzəriyyəbazlıq.

**KABİNƏ** [*fr.*] 1. Budka şəklində kiçik otaq. *Səsvermə kabinəsi. Pilot kabinəsi. Yük maşınının kabinəsi. Telefon kabinəsi. – Endi qəhrəmanım səmadan yerə; Çıxdı kabinədən, daldı göylərə.* M.Rahim. *Mədəd zor-güc Gülşəni kabinədə oturtdu.* Ə.Vəliyev.

2. B a x **kabinet** 2-ci mənada. *Nazir onları öz kabinəsində qəbul etdi.* S.Hüseyn. *Səhnədə müstəntiqin kabinəsi qarşısındakı otaq göstərilir.* S.Rəhman.

3. B a x **kabinet** 6-cı mənada. [Hacı Səməd xanın] *yerinə Tehran kabinəsinin məsləhəti ilə müavini Sərdar Rəşid təyin olundu.* M.S.Ordubadi.

**KABİNKA** [*rus.*] Kiçik kabinə (1-ci mənada). [Fərman] *indi ekskavatorun kabinkasında oturaraq, iri maşını hərlədiyi halda, qızla olan ilk görüşünün təfsilatını xəyalında canlandırırdı.* Ə.Sadıq. *Cuma kabinkada şofer qızı da gördü.* Ə.Əbülhəsən.

**KABOTÁJ** [*fr.*] *dəniz.* Hər hansı dövlətin bir dənizdəki sahilboyu gəmiçiliyi.

**KABOTAJÇI** *is. dəniz.* Kabotaj gəmisində işləyən dənizçi.

**KABRİOLET** *is.* [*fr.*] Biratlı, sürətli, ikitəkərli, yüngül araba.

2. Açılıb-örtülən yüngül avtomobilin örtüklü kuzovu.

**KABUS** *is.* [*ər.*] Qarabasma. *Lakin bu, yuxu deyil, kabus idi.* Ə.Əbülhəsən. // Kölgə. *Küçələri, evləri taun gəzir birbəbir; Bir qara kabus kimi o hər yerə baş çəkir.* B.Vahabzadə. // Qorxulu yuxu, dəhşətli yuxu. // Xəstə təxəyyüllü və ya mistikaya qapılmış adamın gözünə görünən şey, xəyalən təsəvvürə gələn surət. [Qönçə:] *Biri kabus kimi içəri girib qapını qapadı.* S.Hüseyn. *İndi də* [xan] *kabusdan qurtarmayıb, oğlunun hər bir hərəkətindən diksinir, yuxu ilə oyaqlıq arasında idi.* M.Rzaquluzadə.

**KADÉT**[1] [*fr.*] Çar Rusiyasında: qapalı orta hərbi məktəb müdavimi. *Hələ baqidir yerində; Köhnə qaydalar, adətlər; Hələ künc-bucaq gəzir; Yunkerlər, kadetlər.* R.Rza. □ **Kadet korpusu** – 1918-ci il inqilabından qabaqkı Rusiyada: zadəgan oğlanlarını zabitlik xidmətinə hazırlamaq üçün qapalı orta hərbi məktəb.

**KADÉT**[2] [*rus.*] 1905-ci ildə çar Rusiyasında yaradılmış, imperialist burjuaziyanın başlıca partiyası olan konstitusion-demokratik partiyanın üzvü, ya tərəfdarı.

**KÁDMİUM** [*lat.*] *kim.* 1. Sink filizlərinin tərkibində olan gümüşü-ağ yüngül metal; kimyəvi element.

2. Müxtəlif çalarları olan süni sarı boya.

**KADR**[1] [*fr.*] Kino və ya fotolentində ayrı-ayrı şəkil, səhnə. *Kinolentində şəkil hərəkətsiz kadrlardan ibarətdir.* // Kinofilmindən ayrıca bir səhnə, epizod.

**KADR**[2] [*fr.*] 1. Qoşun hissələrinin sülh zamanı tərxis edilməyən daimi heyəti. *Ordu kadrları. Kadr qoşunları.*

2. Hər hansı bir müəssisənin, idarənin, təşkilatın hazırlıqlı, ixtisaslı işçilərinin əsas heyəti (bu mənada adətən cəm şəklində işlənir). *– Doktor Balacayev bu rayonda illər boyu səmərəli çalışmış, Gülöyşə kimi bir çox yerli kadrlar yetişdirmişdi.* S.Rəhimov.

◊ **Kadr şöbəsi** – müəssisənin və ya idarənin işçi tutmaq, işdən çıxarmaq və s. ilə məşğul olan şöbəsi. *Konduktor Kazımı kadr şöbəsinə çağırıb dedilər: – Sabahdan sən qatarda müfəttiş olacaqsan.* Mir Cəlal.

**KADRÍL** [*fr.*] Cüt-cüt oynanılan altı qısa fiqurdan ibarət rəqs və bu rəqsin musiqisi. *Arkadi kənara çəkildisə də, hey Odinsovaya baxır və kadril oynadıqları zaman belə gözünü ondan çəkmirdi.* Turgenevdən.

**KAFÉ** [*fr.* əsli *ər.* qəhvə] Qəhvə, çay, qəlyanaltı və s. satılan kiçik restoran. *– "Novbahar" kafesində Məhbusi* [Kərimxanı] *gözləyəcəkdi.* M.İbrahimov. *Verib Qarabağı Bakıya qaçdıq, Bakıda "Qarabağ" kafesi açdıq.* B.Vahabzadə.

**KÁFEDRA** [*yun.*] 1. Auditoriyalarda mühazirəçi və ya natiq üçün hündür yer; xitabət kürsüsü. *Salonu ağzına almış gurultular arasında Ruqiyyə kafedranın dalına keçdi.* Mir Cəlal.

2. Ali məktəblərdə: məzmunca bir-birinə yaxın olan fənlərdən dərs deyən müəllimlərin və ya tədqiqatçıların birləşməsi. *Fizika kafedrası. Dilçilik kafedrası. Tarix kafedrası.* // Ali məktəbdə bir fəndən, yaxud məzmunca bir-birinə yaxın fənlərdən dərs deyən və ya elmi tədqiqat işi aparan müəllim və ya tədqiqatçılar heyəti. *Kafedra iclası.*

**KÁFEL** [*alm.*] 1. Üzərinə şir çəkilmiş çox nazik kərpic; kaşı. *Kafel zavodu. Kafel ustası.* – [Dadaşov:] *Bilirəm ki, rayonda neçə adama kafel, parket filan satıb...* İ.Məlikzadə.

2. Kafel vurulmuş, üzərinə kafel çəkilmiş; kafeli olan. *Kafel divar. Kafel soba.*

**KAFELÇİ** *is. xüs.* 1. Kafel hazırlayan, kafel qayıran usta, fəhlə.

2. Kafel (kaşı) çəkən usta.

**KAFELLİ** *sif.* Üzünə kafel (kaşı) çəkilmiş. *Kafelli divar. Kafelli mətbəx.*

**KAFEŞANTAN** [*fr.*] Adətən bayağı tamaşalar göstərmək üçün açıq səhnəsi olan kafe, ya restoran; kefxana. [Rüstəm:] *O xanımları ki mən Parisin kafeşantanlarında görmüşəm, sən görsən Məcnunə dönüb biyabanə düşərsən.* Ə.Haqverdiyev.

**KAFƏR** *klas.* bax **kafir.** *Səni qoyub, bütə eylər ibadətin kafər; Əzabi-duzəxə ol vəchdən olur qabil.* Füzuli. *Bu qarə gün ki mənim başıma hicrində gəlib; Həqq nəsib eyləməsin kafərə, ey badi-səba!* S.Ə.Şirvani. *Bayram günü islam olan şad olu; Mən qəmgin olmaqda kafər olmuşam.* Aşıq Ələsgər.

**KAFİ** *sif.* [*ər.*] 1. Kifayət edən, bəs edən, tələbi təmin edən. *Kafi qədər. Kafi məbləğ.* // Zərf mənasında. *Tələbə məclisi nizama saldı, lakin söylənən sözlər heç kəsi kafi dərəcədə məmnun etmədi.* Çəmənzəminli. [Qafar:] *Məgər sansız evlərin kirayəsi ona kafi deyil ki?..* S.S.Axundov. ☐ **Kafi olmaq** – yetmək, bəs olmaq, kifayət etmək. *Tahir bu aləmin gözəlliyini başqasına da sevdirmək üçün sadə, tez-tez işlənən, adi sözlərin kafi olmadığını yalnız indi başa düşdü.* M.Hüseyn.

2. *İs. mənasında.* Tələbənin, şagirdin biliyinə verilən ən aşağı müsbət qiymət. *Riyaziyyatdan "kafi" almaq.*

3. Xəbər şəkilçisi ilə: **kafidir** – bəsdir, yetər, kifayətdir. [Roza:] *Mənzilimiz böyükdür, beş otaq bizə kafidir, ancaq ... burada mənim istədiyim süs yoxdur.* Çəmənzəminli.

**KAFİLİK** *is.* Kifayət etmə, kafi olma; bəslik.

**KAFİR** *sif.* [*ər.*] 1. Müsəlman olmayan, islam dininə etiqad etməyən; qeyri-müsəlman. // İs. mənasında. *Kafir olsaydı əgər rəhmə gələrdi, gözəlim; O qədər ki, sənə mən dərdimi izhar elədim.* Şəhriyar. ☐ **Kafir olmaq** – başqa dinə keçmək (müsəlman haqqında). [Şeyx Hadi:] *Şeyx Sənan, o şəmsi-aləmtab; Oldu kafir, xaç asdı, içdi şərab.* H.Cavid. // Keçmişdə mütərəqqi fikir sahiblərinə, dinə tənqidi yanaşan və ya inanmayan şəxslərə verilən ad; dinsiz, laməzhəb. *Bu fikir köhnə müsəlmanların fikrinə oxşayır: "Rusca danışdın kafirsən, furajka qoydun, kafirsən".* M.S.Ordubadi. // *dan.* Söyüş mənasında (çox vaxt "kafir oğlu kafir" şəklində). *Bu kafir oğlu kafir qoşunu qırdı, qurtardı.* "Koroğlu". [Hacı Fərəc:] *Vermə məni kafir əlinə, bir növ məni qurtar.* N.Vəzirov. [Həmzə:] *Adə, necə, kafir oğlu kafir, qız qaçıb?* C.Cabbarlı. // Bəzən zarafatla: *Ay kafir!*

2. *dan.* Canavar, ilan kimi heyvanların evfemistik adı. [Dursun:] *Az qala kafir məni boğmuşdu, – deyə, qalabalığa qarışdı.* A.Şaiq. *Niyə, ay kişi, olmaya yenə kafir çaldı?* S.Rəhimov. [Həsənəli:] *Köməyə gəlin! ..Kafir məni öldürdü.* M.İbrahimov.

**KAFİRCƏSİNƏ** *zərf* İnsafsızcasına, zalımcasına.

**KAFİRLİK** *is.* 1. Allahı inkar etmə; müşriklik, dinsizlik, küfr.

2. *məc. dan.* Zalımlıq, insafsızlıq mənasında.

**KAFTAN** *is. köhn.* Uzunətəkli qədim kəndli paltarı; don. *Cəfər Bərməki məclislərinin daimi iştirakçısı olan xorasanlı əyanlar qara kaftanlarını çıxardıb kimi ağ, kimi yaşıl geyindi.* Ə.Məmmədxanlı.

**KAFTANLI** *sif. köhn.* Əyninə kaftan geymiş. *Kaftanlı kəndli.*

**KAFTAR** *is.* 1. *zool.* Səhra və yarımsəhra yerlərdə yaşayan və başlıca olaraq leş yeməklə keçinən yırtıcı məməli heyvan; goreşən. [Pəri nənə:] *..Keçmişdə bizim qədim qışlağa bir kaftar dadanmışdı.* S.Rəhimov.

2. *məc. dan.* Qoca, çirkin, idbar adam haqqında (bəzən "qoca" sözü ilə söyüş məqamında). [Gülnaz və Sənəm Məşədi İbada:] *Qoca kaftar, sənə on beş yaş olan qız nə gərək?* Ü.Hacıbəyov. [Bədircahan:] *..Sənin adın çəkiləndə, a kaftar, Züleyxa xanımın qusmağı gəlir.* N.Vəzirov.

**KAFTARKUS** 1. B a x **kaftar** 2-ci mənada. [Fərzəli:] *Görmürsən bu kaftarkusu, necə bu Alagöz qızın üstünə xoruzlanır?* S.Rəhimov.

2. *is.* Keçmişdə el arasında məzhəkəli oyun növü.

**KAFTARLAŞMA** "Kaftarlaşmaq"dan *f.is.*

**KAFTARLAŞMAQ** *f. dan.* Qocalmaq, qocalıqdan siması dəyişmək, qocalıb əldən düşmək.

**KAFTARLIQ** *is. dan.* Qocalıq, qocalıb əldən düşmə.

**KAFUR** *is.* [*ər.*] Həmin adda ağacın kitrəsindən alınan, təbabətdə və texnikada işlədilən kəskin və spesifik qoxulu maddə. ☐ **Kafur ağacı** – Çin, Yaponiya və Hindistan kimi Asiya ölkələrində bitən, dəfnəyə bənzər həmişəyaşıl ağac. *Bizlərdə meyit yuyanda iştənən kafur Hindistan dəryasının cəzirələrində bitən kafur ağacının budaqlarının içində hasil olur.* "Əkinçi". **Kafur yağı** – təbabətdə işlənən bitki yağında həll olunmuş kafur məhlulu; kamfora. [Mələk Kərəmə:] *Kamfora vuracağam. Buna keçmişdə kafur yağı deyərdilər.* M.İbrahimov.

**KAFURİ** *sif.* [*ər.*] Kafura aid olan, tərkibində kafur olan.

**KAĞIZ** *is.* 1. Üzərində yazı yazılan, yazı çap edilən, rəsm çəkilən, yaxud başqa məqsədlər üçün işlədilən, ağac kütləsindən və s.-dən hazırlanan xüsusi material. – *Pul qalmadı, baxmışam hesabə; Getdi qələmə, kağız, kitabə.* M.Ə.Sabir. *Susuram önündə o şeriyyətin; Ürəyim dolsa da, ağ qalır kağız.* M.Araz. ☐ **Divar kağızı** – evin divarlarına çəkilən üzü naxışlı və ya şəkilli kağız. **Papiros (cığara) kağızı** – tütün bükmək üçün zərif, yumşaq kağız növü. **Sumbata kağızı** – b a x **sumbata**. **Suçəkən (suqurulayan) kağız** – b a x **suçəkən. Şirli kağız** – şəkil çəkmək və ya yazı yazmaq üçün üzəri parlaq maddə ilə örtülü kağız növü. // Həmin materialın bir vərəqi, bir parçası. *Bir kağız ver, ərizə yazım.* – [Mirzə Səfər] *stulda əyləşib, qarşısına bir vərəq kağız qoyub, qələm götürdü.* Ə.Haqverdiyev. [Mirzə Mehrəli] *kağızı dizinin üstə sıxışdıraraq gözlüyün üstündən baxa-baxa yazdı..* Çəmənzəminli. *Oturmuş qapıda məktəbli bir qız; Əlində bir qələm, bir parça kağız.* S.Vurğun.

2. Məktub. *Kağız yazmaq. Kağız göndərmək.* – [Mərcan bəy:] *Üçüncü dəfə gördüm, tab gətirə bilmədim və bu kağızı sənə yazdım.* Ü.Hacıbəyov. *Qoy qara kağızım olsun; O kitab dostlara, tanışlara.* M.Araz.

3. Rəsmi mahiyyətdə olan hər cür yazılı sənəd. *Yaş kağızı. İşıq kağızı. Mərkəzdən kağız gəldi.* – [Məmmədcəfər:] *Bu birinci kağızlar ki görürsən, qardaşlarımdan ayrılıq kağızlarımdır.* Qantəmir. [Gəldiyev] *direktor gələndə kağızları kargüzara verdi, imza üçün göndərdi..* Mir Cəlal. // Təliqə. [Aslan bəy:] *Qulu, o yerin kağızını aldınmı? Tapşırmışdım hazır eləsinlər.* N.Vəzirov. // İltizamnamə. *Dilindən kağız vermək.* // Arayış, yazılı məlumat. *Məmməd Həsənoviç bir məsələ üçün yüz yerdən kağız istərdi..* M.İbrahimov.

4. Adətən cəm şəklində: **kağızlar** – qiymətli kağızlar (aksiya, istiqraz, banknot və s). *Kağızlar qiymətdən düşür.*

5. Qumar oynamağa məxsus xüsusi surətdə hazırlanmış kağız parçaları topası; kart. *Kağızı kim paylayacaq? Kağızı kəsmək.*

6. *sif. mənasında.* Kağızdan hazırlanmış, kağızdan düzəldilmiş. *Kağız kisə. – Qoltuqlarında kağız qovluğu və ya portfel olan çinovniklər, vəkillər girib-çıxırdılar.* T.Ş.Simurq. ☐ **Kağız pul** – kağızdan kəsilmiş pul, kredit bileti. *Xəlilin atasından bir balaca, iki otaqdan ibarət ev və iyirmi iki manat kağız pul qalmışdı.* Ə.Haqverdiyev. [Məşədi] *gündən-günə qiymətdən düşən kağız pulun müqabilində gündən-günə qiymətə minən dupduru qızıl alırdı.* S.Rəhimov.

◊ **Kağız kimi** – ağappaq, qar kimi, lap ağ. **Kağız kimi ağarmaq** – rəngi qaçmaq (çəkilmək), sifəti ağappaq olmaq. *Gövhər qarı*

*gizlincə Şahnaza baxdı. Qızın rəngi kağız kimi ağarmışdı.* İ.Şıxlı. **Kağız üzərində qalmaq** – həyata keçməmək (keçirilməmək), yerinə yetirilməmək, icra olunmamaq. **Kağızını almaq** *dan.* – boşanmaq. **Kağızını vermək** *dan.* – boşamaq. [Güllü:] *Kağızımı ver, kəbinim halal, canım azad.* Ə.Haqverdiyev. **Dilindən kağız vermək** – rəsmən öhdəsinə götürmək.

**KAĞIZBADAM** *is.* Nazik qabıqlı badam növü.

**KAĞIZÇILIQ** *is. dan.* Heç bir ehtiyac olmadan çoxlu, müxtəlif kağızlar yazmaqla məsələnin həllini qəsdən uzatma; süründürməçilik, bürokratçılıq.

**KAĞIZI** *sif.* Nazik qabıqlı. *Kağızı qoz. – Həvəslə dedi Bəhram: – Mən ancaq kağızı badam; Bir də hulu əkmişəm.* M.Rahim.

**KAĞIZ-KUĞUZ** *top. dan.* Yazılı kağızlar, yaxud lüzumsuz kağızlar. *Qarı elə elədi ki, söhbət Mirzə Mustafanın başından fikrini dağıtdı, kağız-kuğuzunu yığışdırıb qoydu şkafa, dəftərxanasının qapısını bağlayıb getdi evinə.* E.Sultanov. [Xəlil:] *..Otaqları elə silibsüpürüb aparıbdır ki, kağız-kuğuzdan savayı bir şey qalmayıbdır.* N.Vəzirov. *Şahmar yavaş-yavaş kağız-kuğuzu, cədvəlləri yığışdırır, kitabları üst-üstə qoyurdu.* B.Bayramov.

**KAĞIZ-QƏLƏM** *is.* Kağız və qələmdən ibarət yazı ləvazimatı; kağız və qələm. [Sərvər Məşədi İbada:] *Tez ol, bir kağızqələm götür!* Ü.Hacıbəyov. [Sara:] *Əbdül əmi, bir az mənə kağız-qələm ver!* C.Cabbarlı. *Vaxt olur götürüb kağız-qələmi; Qaçmaq istəyirəm Yer kürrəsindən.* M.Araz.

**KAĞIZLAMA** "Kağızlamaq"dan *f.is.*

**KAĞIZLAMAQ** *f.* Üzərinə kağız yapışdırmaq, kağız çəkmək. *Divarları kağızlamaq.*

**KAĞIZLANMA** "Kağızlanmaq"dan *f.is.*

**KAĞIZLANMAQ** *məch.* Üzərinə kağız yapışdırılmaq, kağız çəkilmək. *Divarlar kağızlanmışdır.*

**KAĞIZLANMIŞ** *f.sif.* Üzərinə kağız yapışdırılmış, kağız çəkilmiş. *Kağızlanmış otaq.*

**KAĞIZLAŞMA** "Kağızlaşmaq"dan *f.is.*

**KAĞIZLAŞMAQ** *qarş.* Məktublaşmaq, birbirinə məktub yazmaq. *Çoxdandır onunla kağızlaşmıram.* – [Əbdüləli:] *Biz onunla kağızlaşırdıq.* S.Rəhimov.

**KAĞIZLATMAQ** *icb.* Üzərinə kağız çəkdirmək, kağız yapışdırtmaq. *Divarı kağızlatmaq.*

**KAĞIZLI** *sif.* Kağızı olan, əlində kağızı (rəsmi sənədi) olan (b a x **kağız** 3-cü mənada).

**KAĞIZPAYLAYAN** *is. dan.* Kuryer. // Poçtalyon. *Kağızpaylayana ixtiyar vermişik ki, müştərilərimizdən qabaqca bir şey almayınca onların jurnalını aparıb verməsin.* "Mol. Nəsr."

**KAĞIZPƏRƏST** *is.* Kağızlara, işin rəsmi cəhətinə həddindən artıq əhəmiyyət verən adam; rəsmiyyətçi (b a x **kağız** 3-cü mənada).

**KAĞIZPƏRƏSTLİK** *is.* Quru rəsmiyyətçilik, işin mahiyyətinə deyil, rəsmi cəhətinə həddindən artıq fikir vermə.

**KAĞIZSIZ** 1. *sif.* Kağızı olmayan (b a x **kağız** 3-cü mənada).

2. *zərf* Kağızı, rəsmi sənədi olmadan, yaxud iltizamnaməsiz, qəbzsiz, dilindən kağız vermədən. [Hacı Murad] *çox adama pulu kağızsız vermişdi.* S.S.Axundov.

**KAH, KAHA** *is. məh.* Qayalıqda, dağda təbii və ya süni oyuq; mağara. *Bədircahanın evinin sağ tərəfində, qayanın ortasında üç kaha var çox dərin.* N.Vəzirov. *Bir həftə qabaq yuxarıdan gələn bir sürü soyğunçu kəndi alt-üst elədi, canını qurtaran qaçıb meşələrdə, kahalarda gizləndi.* Ə.Məmmədxanlı.

**KAHAL** *sif.* [*ər.*] *dan.* Başısoyuq, tənbəl, ağırtərpənən. *Qaragözov ayağa qalxdı: – Elə bilirsiniz ki, müalicə işinə təkcə siz kahalsınız?* Mir Cəlal.

**KAHALIQ** *is.* Çoxlu kaha olan yer (qayalıq, dağ və s.).

**KAHALLIQ** b a x **kahıllıq.** *Demə fərraşların kahallığından yolda dustaqların biri əkilibmiş.* "M.N.lətif."

**KAHI** *is. bot.* Yaşıl-ağımtıl yarpaqları və kökü çiy yeyilən kələməoxşar birillik tərəvəz bitkisi. *Yavaş-yavaş dəyər, yetər ləzzətli, dadlı meyvələr; Gilasü, albalı, kahı, xoş iyli sarı heyvalar.* A.Səhhət.

**KAHIL** *sif. dan.* Başısoyuq, tənbəl, ağırtərpənən, işə can yandırmayan.

**KAHILLAŞMA** "Kahıllaşmaq"dan *f.is.*

**KAHILLAŞMAQ** *f. dan.* Tənbəlləşmək, atilləşmək, ağırlaşmaq.

**KAHILLIQ** *is. dan.* Başısoyuqluq, tənbəllik, atillik. □ **Kahıllıq etmək** – tənbəllik etmək, başısoyuqluq etmək, ərinmək.

**KAHİL** [*ər.*] b a x **kahıl.** *Kimə olsan müsahib, ey cahil; Olur əlbəttə tənbəlü kahil.* Füzuli. *Əvvələn, ümdeyi-mətləb bu ki, şəhr əhli tamam; Tənbəlü kahilü bihimmətü nadan, mənə nə?!* M.Ə.Sabir.

**KAHİN** *is.* [*ər.*] Qədim misirlilərdə, israillilərdə qeybdən xəbər verən ruhani.

**KAHİNANƏ** *zərf* [*ər.* kahin və *fars.* ...anə] *köhn.* Kahin kimi, qeybdən xəbər verərcəsinə.

**KAHİNLİK** *is.* Kahinin işi, peşəsi. // Qeybdən xəbər vermə iddiasında olma.

**KAİNAT** *is.* [*ər.*] 1. Bütün dünya sistemi (Yer, göy, ulduzlar və b. varlıqların məcmusu). *Günəş kainatda mövcud olan saysız-hesabsız ulduzlardan biridir.* – [Qadın:] *Yer, göy – bütün kainat bir xoş səda olaraq məni oxşayır, eyni zamanda da için-için inlədirdi..* Çəmənzəminli. *Mənə elə gəldi ki, bizlərdən əvvəl nə yer, nə göy, nə həyat olmuş; Nə bu ucsuz-bucaqsız, gözəl kainat olmuş.* M.Müşfiq.

2. Dünya, aləm, bütün yer üzü, bütün varlıq. [Almaz:] *Deyirlər ki, səmimi eşqin ürəyi geniş olar. Orada kainat belə yerləşər.* C.Cabbarlı. *Göyləri sarsıdan bu qorxunc gurultudan bütün kainat titrədi.* H.Nəzərli.

**KAKADU** is. [*alm.*] Malayya tutuquşusu.

**KAKÁO** [*isp.*] 1. Toxumundan şokolad hazırlanan tropik bitki. *Həmişəyaşıl tropik ağac olan kakao bitkisinin kənarı bütöv böyük yarpaqları vardır.* R.Əliyev.

2. Həmin ağacın üyüdülmüş toxumu. // Həmin toxum tozundan hazırlanan qidalı şirin içki. *Bir stəkan kakao. Uşaqlara kakao verdilər.* – *İkilikdə yuxarı getdilər, kafedə oturub kakao içdilər.* M.Süleymanov.

**KAKİL** [*fars.*] *klas.* b a x **kəkil**. *Gah yad zülfün eyləyirəm, gah kakilin; Bir fikri etməmiş, dilə fikri-digər gəlir.* S.Ə.Şirvani. *Ey alnın ay, üzün günəş, ey qaşların kəman; Ceyran gözün, qarışqa xətin, kakilin ilan.* M.Ə.Sabir.

**KÁKTUS** [*lat.*] b a x **maldili**.

**KAQÓR** [*coğr. addan*] Qırmızı desert şərabı.

**KAL** *sif.* 1. Dəyməmiş, yetişməmiş, göy. *Kal yemiş. Kal tut. Kal alça.* – [Hurizadın] *..tükləri məzəli bir rəng alar – gah qarğıdalı saçağına, gah da kal qarpıza bənzər.* Çəmənzəminli. *Nəbi güllə atsa düzdə, ya dikdə; Tağlar meyvəsini yerə kal salar.* M.Rahim. // İs. mənasında. *Əriyin kalı.* – *İyid nərəsindən, güllə səsindən; Dəyməmiş tökülür kalların, dağlar!* Aşıq Ələsgər.

2. *məc.* Hələ yetişməmiş, inkişaf etməmiş. *Almaniyanın İngiltərə-Fransa-Rus əleyhinə düzəltdiyi cahangirlik təşkilatı da hələ uşaqdır, kaldır, yetişməmişdir.* M.S.Ordubadi. *Bax, bu yerlərdə adamlar dəyişir; Kal* (z.) *gələn burda dəyir, tez yetişir.* S.Rüstəm.

3. *məc.* Tutqun, boğunuq (səs haqqında). [Vəkil] *kal səsi ilə Nemətə yer göstərdi.* Çəmənzəminli. *Əsgərin qulağında Əlyarın kal səsi eşidildi.* S.Rəhimov.

4. *məc. dan.* Kütbeyin, gecanlayan. *Kal adam.* – *Yaş yetirib kal oldunuz; Görə-görə kor oldunuz; Dinə-dinə lal oldunuz; Səbrinizə heyrətdəyik; Siz dözümdə fil oldunuz.* B.Vahabzadə.

◊ **Yuxudan kal oyanmaq** – lazımınca yatıb yuxusunu almamaq, yuxudan yarımçıq durmaq. [Səttar:] *Əşi, yuxudan kal oyanıb gözümü açıram, görürəm, gün təzəcə çırtlayır.* Ə.Əbülhəsən.

**KALA**[1] *is.* Üzəri liflə örtülmüş, pambıq çiyidi.

**KALA**[2] *is. məh.* Böyük şüşə qab, iri şüşə banka.

**KALAFA** *is.* 1. Dağılmış tikintinin qalığı, dağılmış yer; xarabalıq. *Kənd yıxılsa, kalafasından məlum olar.* (Ata. sözü).

2. İri deşik (divarda və s.-də); iri çuxur, oyuq. *Qaralır daxmanın kalafa yeri; Dəstə şərqisilə çəkilir geri.* S.Vurğun.

3. *məh.* Quyu.

◊ **Bir kalafa sümükdür** – çox arıq adam haqqında.

**KALAFAAĞIZ** *sif. zar.* Çox iri ağzı olan.

**KALAFALIQ** *is.* Kalafası olan; xarabalıq. [Qatır Məmməd] *evlərinin kalafalığında bir daşın üstündə oturub, .. dərin sükuta getdi.* "Qatır Məmməd".

**KALAĞAY(I)** b a x **kəlağayı.** *Bu diyarda kalağay yox, kətan yox.* M.P.Vaqif. *Başında*

*Herat kalağay, paltarları darayıdı.* Aşıq Ələsgər. *Gözəl surət sahibi olan bu qadın qara paltar geymiş, başına yaşıl-ağ ipək kalağayı salmışdı.* T.Ş.Simurq.

**KALAMBUR** [*fr.*] Cinas.

**KALAN** *sif. dan.* Varlı, pullu, cibi dolu. *Oğlan yəqin kalan idi...* S.Rəhman. *Qonşum bu məclisə yalnız puldan kalan adamları çağırır.* S.Rüstəm.

**KALAVA** *is. məh.* Dərə.

**KALBA** *dan. köhn.* bax **kərbəlayı.** *Nə xortlayaydı bu şəkil ilə Molla Nəsrəddin, ey kaş; Nə kalba səbzalılarda bu xofü-vəhşət olaydı.* M.Ə.Sabir.

**KALENDÁR** [*lat.*] bax **təqvim.** *Divarımdan asılı kalendardan hər gecə; Bir döyüş və bir zəfər yarpağını cırıram.* S.Rüstəm. □ **Kalendar plan** – kalendar (təqvim) üzrə müəyyən edilən plan. *Klubun kalendar planı hamıya məlumdur.* Mir Cəlal.

**KALEYDOSKÓP** [*yun.*] 1. Əldə fırlatdıqda tez-tez dəyişən, rəngli naxışlar göstərən, boruşəkilli optik cihaz (oyuncaq).

2. *məc.* Hadisələrin, şəxslərin və s.-nin ardı-arası kəsilmədən dəyişməsi. *Əgər "Ağa Məhəmməd şah Qacar" faciəsi kaleydoskop isə, görünür ki, cənab tənqidnəvis bu ləfzin nə olduğunu layiqincə düşünməyib, fəqət bir xarici ləfzi, heç məhəli olmayaraq istemal etmişdir; çünki cəmi tarixi faciələr kaleydoskopdurlar.* Ə.Haqverdiyev.

**KALIM** *is. etnoqr.* Orta Asiyada: evlənərkən oğlanın qızın ata-anasına verməli olduğu pul, mal və s.; başlıq və bu adətin özü.

**KALIŞ** *is.* 1. *bot.* Yarpaqları iti, uzun, yumşaqbuğumlu, qamışa oxşar bitki. *Kalış yeyib zəhərlənmək* (mal-qara haqqında). – *Bostanın ətrafını kalış basmışdı.* İ.Şıxlı.

2. *məh.* Göy, təzə (soğan haqqında). *Kalış soğan, qırmızı turp, müxtəlif göyərti iştaha ilə yeyilirdi.* Ə.Vəliyev.

**KALIŞLIQ** *is.* Çoxlu kalış bitən yer. [Rüstəm kişi] *kalışlığın arasındakı qarpızlardan birini götürüb geri qayıtdı.* İ.Şıxlı.

**KALÍBR** [*fr.*] 1. *xüs.* Silah lüləsi diametrinin ölçüsü; çap. *Kalibri böyük toplar.* // Mərmi və ya güllənin diametri.

2. *tex.* Kütləvi istehsal olunan şeylərin dəqiq, müəyyən ölçüsü.

3. *tex.* Məmulatın ölçüsünü, formasını və s. yoxlamaq üçün ölçü aləti.

**KALİBRLƏMƏ** "Kalibrləmək"dən *f.is.*

**KALİBRLƏMƏK** *f. tex.* 1. Bir şeyin kalibrini ölçmək və ya yoxlamaq, bir şeyə lazımi kalibr vermək. *Relsləri kalibrləmək.*

2. Ölçü alətlərinin bölgü dərəcələrini yoxlamaq. *Termometri kalibrləmək.*

**KALİBRLƏNMƏ** "Kalibrlənmək"dən *f.is.*

**KALİBRLƏNMƏK** *məch. tex.* Kalibrləmə işi aparılmaq, bir şeyin kalibri ölçülmək, yoxlanmaq.

**KALİBRLƏNMİŞ** *f.sif. tex.* Kalibri yoxlanmış (ölçülmüş), lazımi kalibr verilmiş.

**KALİBRLƏYİCİ** *sif. xüs.* Kalibrləmə işi ilə məşğul olan işçi (bax **kalibr** 2-ci mənada).

**KALİBRLİ** *sif. xüs.* Müəyyən kalibrdə olan, müəyyən ölçüsü olan, qəbul edilmiş kalibrə uyğun olan. *Müxtəlif kalibrli toplar.*

**KALİBRÖLÇƏN** *is. tex.* Kütləvi istehsal olunan ölçü cihazlarının dəqiq kalibrini müəyyən etmək üçün ölçü aləti (əndazə, qəlib və s).

**KÁLİUM** [*lat.* əsli *ər.* əlkali] *kim.* Qələvi filizlər qrupundan gümüşü-ağ rəngli metal – kimyəvi element.

**KALİUMLU** *sif. kim.* Kalium qarışdırmaqla hazırlanmış, tərkibində kalium olan. *Kaliumlu duzlar.*

**KÁLKA** [*fr.*] 1. Çertyojlardan, yaxud şəkillərdən dəqiq surət çıxartmaq üçün xüsusi üsullarla hazırlanmış nazik şəffaf kağız və ya parça.

2. Çertyojun və ya şəklin həmin material üzərində çıxarılmış surəti.

3. *dilç.* Başqa bir dildəki söz, ya ifadəyə təqlid və ya hərfi tərcümə yolu ilə düzəldilən söz və ya ifadə. *Kalka düzəltmək. Kalka üsulu. "Otbiçən" rusca "senokos" sözünün kalkasıdır.*

**KALKULYÁSİYA** [*lat.*] Malın maya və satış qiymətinin hesablanması. *Malın kalkulyasiyası. Kitabın kalkulyasiyası* (kitabın dəyərini müəyyən etmək üçün mətbəə işarələrinin hesablanması).

**KALKULYASİYAÇI** *is.* Kalkulyasiya ilə məşğul olan mühasibat işçisi; kalkulyator.

**KALKULYÁTOR** [latıncadan] bax **kalkulyasiyaçı.**

**KALLAŞMA** "Kallaşmaq"dan *f.is.*

**KALLAŞMAQ** *f.* Səsi tutulmaq, boğunuq hala düşmək. *Kallaşa-kallaşa karlaşır insan; İçinin səsini çölü eşitmir...* M.Araz.

**KALLAŞMIŞ** *f.sif.* Boğuq, tutqun (yalnız səs haqqında). *Əminə .. yuxusuzluqdan kallaşmış səslə dedi: – İkidir, üçdən beş dəqiqə işləyib.* İ.Məlikzadə.

**KALLIQ** *is.* 1. Yetişməmiş meyvənin, məhsulun halı. *Almanın kallığı. Üzümün kallığı.*

2. *məc. dan.* Kütbeyinlik, kütlük, korazehinlik, qanmazlıq. *Atlıxan Orxanın kallığına, keyliyinə təəccüblənirmiş kimi çiynini çəkdi.* İ.Məlikzadə. ☐ **Kallıq etmək** – qanmazlıq etmək, düşüncəsiz hərəkət etmək.

**KALLİQRÁF** [*yun.*] b a x **xəttat.**

**KALLİQRAFİK** [*yun.*] Kalliqrafiyaya aid. ☐ **Kalliqrafik xətt** – gözəl, aydın, düz xətt (yazı).

**KALLİQRÁFİYA** [*yun.*] b a x **xəttatlıq.**

**KALMIK** *is.* Rusiya Federasiyası tərkibində Kalmık MR-in əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *XVII əsrin 30-cu illərində Aşağı Volqada kalmıklar meydana çıxdılar. Kalmıkların nəsilləri oyratlardır.*

**KALMIKCA** *sif.* və *zərf* Kalmık dilində. *Kalmıkca kitab. Kalmıkca danışmaq.*

**KALORİMETR** [*lat.* ca1or – isti və *yun.* metreo – ölçürəm] İstilik miqdarını ölçən cihaz.

**KALORİMÉTRİYA** [*lat.* calor – isti və *yun.* metreo – ölçürəm] Fizikanın müxtəlif cisimlərin istilik tutumunu ölçməklə məşğul olan sahəsi.

**KALORİYA** [*lat.*] İstilik ölçüsü vahidi. ☐ **Böyük kaloriya** – bir kiloqram suyun hərarətini bir dərəcə artırmaq üçün lazım olan hərarətin miqdarı. **Kiçik kaloriya** – bir qram suyun hərarətini bir dərəcə artırmaq üçün lazım olan hərarətin miqdarı. // Hər bir qidanın insan orqanizmində yaratdığı istilik enerjisinin miqdarı. *Bəzi qidalarda kaloriya azdır.*

**KALORİYALI** *sif.* Kaloriyası çox olan. *Kaloriyalı qidalar.*

**KALORİYALILIQ** *is.* İstilik doğurma qabiliyyəti; bir şeydə olan kaloriyanın (istiliyin) miqdarı. *Yanacağın kaloriyalılığı. Xörəyin kaloriyalılığı.*

**KÁLSEKS** [*lat.*] *əcz.* Xlorlu kalsium və urotropin duzu (qripin qabağını almaq üçün dərman kimi işlənir).

**KÁLSİUM** [*lat.*] *kim*. Əhəngdaşı, mərmər və s. tərkibində olan gümüşü-ağ rəngli metal – kimyəvi element.

**KÁLTA** *bot.* b a x **sunərgizi.** *Azərbaycanın dağ-meşə qurşağının bataqlıq yerlərində bitən kalta* (*sunərgizi*) *cinsinin .. bişirilib qurudulmuş köklərindən fəsəli bişirmək olur.* M.Qasımov.

**KALVİL** [*fr.* xüs. addan] Sarımtıl alma növü. *Kalvil alması.*

**KALVİNÍST** [xüs. addan] Kalvinizm məzhəbinə mənsub adam.

**KALVİNÍZM** [xüs. addan] XVI əsrdə İsveçrədə Kalvin adlı şəxs tərəfindən təsis edilmiş protestant məzhəblərindən biri.

**KAM$^{1}$** *is.* [*fars.*] 1. Arzu, məqsəd, məram, murad. *Neçə ildir gözümüzü Mürsəlin toyuna dikmişik, bu bizim üçün böyük kamdır...* A.Şaiq. *Zaman bizdən kam alıbdır; Daha ürək qocalıbdır; Bizdən ancaq ad qalıbdır; Nə sən gülsən, nə mən bülbül.* B.Vahabzadə. ☐ **Kam almaq** – 1) b a x **kama yetmək (yetişmək, çatmaq).** *Fərhad, Məcnun, Kərəm kamın almadı; Bir Yusifi sevdiyinə yetirdin.* Molla Cümə. *Biz də muradımızca fələkdən kam alaydıq; Sizə qonşu olaydıq.* M.Müşfiq; 2) intiqam almaq, əvəz olaraq birinin fəlakətinə sevinmək. **Kam bulmaq** *köhn.* – b a x **kam almaq** 1-ci mənada. *Fəsli-bahar gəldi, könül, şad, kam bul!* Q.Zakir. **Kam vermək** – arzusuna, kamına yetirmək. *Xəstədir, Qövsi, təbibin, dərd bilmək çağıdır; Çarə qılmaq, kam vermək, könül almaq çağıdır.* Qövsi. **Kama yetirmək** – arzusuna çatdırmaq. **Kama yetmək (yetişmək, çatmaq)** – arzusuna nail olmaq, məqsədinə çatmaq. *Deyin sərvi-güləndama; Öldürsün, yetişsin kama.* Q.Zakir. [Mirzə Rza:] [Nəsrəddin şahı] *öldürdüm, indi kama yetişdim!* C.Cabbarlı. *Yoxsa yetməyəcək kamına şair; Quru bir taxtanı simsiz çalacaq?* S.Vurğun. **Kami-dil** *klas.* – ürək arzusu. *Şükr Seyyid, gedirəm kami-dil ilə bu səhər.* S.Ə.Şirvani. **Kamı gözündə qalmaq** – arzusuna çatmamaq, arzusu ürəyində qalmaq. *Gözündə qalmasın insanın kamı.* Z.Xəlil.

2. *klas.* Ləzzət, zövq. □ **Kam vermək** – zövq vermək, ləzzət vermək. *Açdın dəri-iltifatü ənam; Verdin gərəgincə hər kəsə kam.* Füzuli. **Kam götürmək** – zövq almaq, ləzzət almaq. [Qadın:] *İkicə nəfər belə balam olaydı, hərəsini bir məktəbə qoyaydım, hər gün birinin yanına gedib baxanda kam götürəydim.* Mir Cəlal.

3. **Kamınca, kamımca** şəklində *köhn.* – ürəyincə, ürəyimcə; istədiyin kimi, istədiyim kimi. *Seyyid, təhəmmül et şəbi-hicranə, çəkmə ah; Bir gün olur ki, kamınca ruzigar olur.* S.Ə.Şirvani. *Yüz il yaşayıb bircə gün ömrümdə fələkdən; Kamımca mədar olmasa, mən neyləyə billəm?* Ə.Vahid.

**KAM**[2] *is.*: **kamına çəkmək** – udmaq. *Əjdaha itaət edib cəhənnəmi çəkdi kamına.* Ə.Haqverdiyev. *İkibaşlı əjdaha kimi* [sel] *ağzını açıb, bizi kamına çəkmək istəyirdi.* S.Rəhimov.

**KAMAL** *is.* [*ər.*] 1. Kamillik, yetkinlik.

2. Elm, ürfan, fəzilət. [Hacı Nuru şair:] *Atan oxumuşdu, kamalı var idi.* M.F.Axundzadə. *Ana gərək övladına kamal işığını bağışlasın.* C.Məmmədquluzadə. □ **Kamala çatmaq (yetmək, yetişmək)** – yetkinləşmək, yetkinlik dövrünə çatmaq; kamilləşmək, təkmilləşmək. *Bədəsillər çətin yetər kamala; Əgər ki, oxuya üzündən məni.* Q.Zakir. *Bəlkə də yetməmiş dünya kamala; Bəlkə də görməyir bu dəhşətləri.* S.Vurğun. [Əliş Gülcamala:] *Sonra da Gəncədə məktəbə getdik; Bir yerdə oxuyub kamala yetdik.* Z.Xəlil. // Nöqsansızlıq, mükəmməllik, tamamlıq, bitkinlik. **Kamala yetirmək** – yetişdirmək, dərs vermək, yetkinləşdirmək. *Vaqif kimi molladan dərs almısan; Gər yetirsin səni kamalə, Yetər.* M.P.Vaqif.

3. Ağıl, zəka, dərrakə. *Kamil insan kamalından bəlli olar.* (Ata. sözü). *Ələsgər söyləyə söz müxtəsərin; Ağlı kamil ola, kamalı dərin; Hamı bir ağızdan deyə "afərin!"* Aşıq Ələsgər. □ **Kamal sahibi** – ağıllı, dərrakəli (adam). *Gün kimi neməti-xubluqda kamal sahibidir.* M.P.Vaqif. **Kamalı (kamaldan) azmaq** – ağlını itirmək, dəli olmaq. *Mahitəmamə eylədi nisbət camalını; Nöqsanı var ki, Seyyid azıbdır kəmaldən.* S.Ə.Şirvani. // İnsan ömrünün yetkinlik dövrü.

4. İzafət tərkiblərində: qoşulduğu sözə bitkinlik, tamlıq, mükəmməllik mənası verir; məs.: *kamali-ehtiramla* (tam ehtiramla, artıq ehtiramla), *kamali-ləzzətlə* (böyük ləzzətlə), *kamali-diqqətlə* (tam diqqətlə, böyük diqqətlə). – *..Əgər bəzi şəxslərə həmin məsələ* [papaq məsələsi] *əhəmiyyətsiz və xırda bir məsələ görsənsə, biz kamali-cürətlə deyə bilərik...* C.Məmmədquluzadə. [Səlim] *kamali-etidalla gözləyirdi ki,* [Mehriban] *ağlayıb ürəyini boşaltsın.* S.Hüseyn. *..Kamali-ehtiramla* [Hacı Qambay və Məşədi Heybətə] *salam verdim.* Qantəmir.

◊ **Kamal attestatı** – tam orta məktəbi qurtarmaq haqqında attestat.

**KAMALINCA** *zərf köhn.* Lazımi dərəcədə, mükəmməl surətdə, kifayət qədər; lazımınca. *Bu vaxtadək nə Qasım bəy Zakirin və nə Hacı Seyid Əzim Şirvaninin tərcümeyi-halları və əşarü asari kamalınca öyrənilməyib.* F.Köçərli.

**KAMALLANMA** "Kamallanmaq"dan *f.is.*

**KAMALLANMAQ** *f.* Əqlən kamilləşmək, yetkinləşmək.

**KAMALLI** *sif.* Kamal sahibi olan; ağıllı, tərbiyəli, mərifətli. *Kamallı uşaq.* – [Şərəfnisə xanım:] *Nə sözdür ki, sənin kimi cavan, kamallı oğlan Tiflisdə qulluq tapmaz?* M.F.Axundzadə. [Hacı:] *Oğlanlarım, ağıllı olun, kamallı* (z.) *olun, gəlinlər sizi bir-birinizdən ayırmasın.* Qantəmir. *Mən sənin gözlərindən görürəm, kamallı balasan, ancaq kimə nə fayda?!* S.Rəhimov.

**KAMALLILIQ** *is.* Əqli cəhətdən kamillik, yetkinlik, bitkinlik.

**KAMALSIZ** *sif.* Ağlı-kamalı olmayan, əqli cəhətdən kamil olmayan; mərifətsiz. [Qadın:] *Cənab, belə sözləri nə üçün buyurursunuz? .. Mən onlara ağılsız, qabiliyyətsiz, kamalsız deyə bilmərəm.* Ə.Haqverdiyev.

**KAMAN** *is.* [*fars.*] 1. B a x **kamança.** *Nə qədər dərdlidir o qırıq kaman; Şikayət eyləyir öz dünyasından.* S.Vurğun. *Söylədik qan ağlayan Araza dərdimizi.* S.Rüstəm. *Sular üstə yayılır; Tar səsi, kaman səsi.* İ.Səfərli.

2. Oxatan yay. *Ox atılır, sanki kaman səslənir; Saheyi-meydanda vurur tək səbir.* M.Ə.Sabir. *Nişançılar dərhal kamanlarını çiyinlərindən çıxarıb, xurma ağacları içərisinə yüyürdülər.* Ə.Məmmədxanlı.

◊ **Kaman kimi əyilmək** *məc.* – beli əyilmək (bükülmək), ikiqat olmaq. **Kaman kimi (tək) əymək** *məc.* – belini əymək. *Eləmi deyər məni; Yadlara deyər məni; Ayrılıq uzun olsa; Kamantək əyər məni.* (Bayatı). **Kamana dönmək** – bax **kaman kimi əyilmək.** *Əziziyəm çəkməkdən; Qəlyan alıb çəkməkdən; Qəddim kamana döndü; Qürbət dərdi çəkməkdən.* (Bayatı). **Qaşı kaman** *şair.* – bax **kamanqaş(lı).** *Qaşları kaman, ay qız; Apardın iman, ay qız; Dedim, hara gedirsən? Oldun bədgüman, ay qız!* (Bayatı). *Müjganların oxdu, qaşların kaman; Gözlərin qəsd edər cana, Gülpəri!* Aşıq Ələsgər. [Sultan bəy:] *Aman, aman, oy, qaşı kaman, oy! Gəl alım, maralım, dilbilməz!* Ü.Hacıbəyov.

**KAMANÇA** *is.* [*fars.*] Alt tərəfi diz üstünə qoyulub yayla çalınan musiqi aləti; kaman. *Kamança çalmaq. Kamança kirişi. – Məclisin dalından kamança səsi eşidilir.* Ə.Haqverdiyev. *Alqışlar altında endi səhnədən; Yenidən kamança dindi səhnədən.* B.Vahabzadə.

**KAMANÇAÇALAN, KAMANÇAÇI** *is.* Kamançada çalan çalğıçı. *Tarzən ilə kamançaçı məharətlə çalır, qavalvuran oğlan isə boğazını arıtlayıb oxumağa hazırlaşırdı.* M.Hüseyn. *Rəşid, eyni zamanda ən coşqun bir ovçu, ən mahir bir kamançaçıdır.* M.Rzaquluzadə.

**KAMANÇAÇILIQ** *is.* Kamança çalma sənəti.

**KAMANÇALAN** bax **kamançaçalan.** *Kamançalan kimdir o? – Bəxtiyar! Küləkmi, ya simdir o? – Bəxtiyar!* R.Rza.

**KAMANÇI** *is.* bax **kamançaçı**.

**KAMANDAR** *is.* [*fars.*] *köhn.* 1. Oxatan, mahir atıcı. *Kamandar atar oxunu; Al eylədim mən çoxunu.* "Koroğlu". *Kamil kamandardı, atıb-vurandı; Qovğa günü igidləri yıxandı.* Aşıq Ələsgər.

2. Qədimdə ağasının yanınca ox-yayını gəzdirən xidmətçi.

**KAMANDARLIQ** *is. köhn.* Kamandarın işi, vəzifəsi.

**KAMANƏ** *is.* [*fars.*] *köhn.* Kamanın, kamançanın yayı. *Mehrabi-qaşın fikri bu xəm qəddimi, ey məh; Döndərdi qaşın kimi kamanə, ölürəm mən.* Ə.Vahid.

**KAMANQAŞ(LI)** *sif. şair.* Qaşları kaman (yay) şəklində olan. *Harda görsəm şux kamanqaşlını; İstərəm canımı qurban eyləyim.* M.P.Vaqif. *Ey kamanqaşlı, məni yarələdi qəmzən oxu; Zülfünü bas yarama, qoyma məni qan apara.* S.Ə.Şirvani.

**KAMBAĞI** *is.* Atın dalındakı yükü bağlamaq üçün ip.

**KÁMBALA** [*fin.*] *zool.* Gözləri başının bir tərəfində olan yastı balıq.

**KAMÉLİYA** *is.* [*fr.*] Tüklü yarpaqları və iri gözəl gülləri olan ağac; gül adı.

**KÁMERA¹** [*lat.*] 1. Bəzi idarələrdə xüsusi məqsədlər üçün ayrılmış otaq. *Dezinfeksiya kamerası. Əl baqajı kamerası.*

2. Həbsxanada dustaqların salındığı otaqlardan hər biri. *Kameraya ağır bir sükut çökdü.* M.Hüseyn. *Dünya bir an içində; Kameraya çevrilib, necə balacalandı; Soyuq tər basdı məni; Dedim, dar ağacından öz dilim asdı məni.* B.Vahabzadə.

3. *tex.* Hər hansı bir cihazın, maşının, qurğunun içindəki qapalı boşluq. *Peçin kamerası. Sıxılmış hava kamerası.*

4. Fotoaparatın, plastinka ya plyonka qoyulan, işıq keçməyən içəri hissəsi.

5. Şinin, topun içərisinə hava doldurulan rezin kisəsi. *Avtomobil şininin kamerası. Futbol topunun kamerası.*

**KAMERA²: kamera musiqisi** – bir və ya bir neçə ifaçı üçün yazılmış musiqi əsəri. *Kamera musiqisi əslində kiçik binalarda ifa edilmək üçün yaradılan vokal və instrumental əsərlərdən ibarət olur.* Ə.Bədəlbəyli. **Kamera konserti** – kamera musiqisi əsərlərindən ibarət konsert.

**KAMERÁL** [*fr.*]: **kameral işləri, kameral işləmə** – ekspedisiya və çöl-axtarış işləri zamanı toplanmış materialların laboratoriyada, kabinədə işlənməsi. *Dialektoloji ekspedisiya materiallarının kameral işlənməsi.*

**KAMERALI** *sif. tex.* Kamerası olan (bax **kamera¹** 3-cü mənada). *Kameralı peç. Kameralı şlüz.*

**KAMERAYAMAYAN** *is. dan. xüs.* Deşilmiş avtomobil kameralarını vulkanizasiya üsulla yamayan usta; vulkanizator.

**KAMERTÓN** [*alm.*] Çalğı alətlərini, habelə xor oxuyarkən səsindən əsas ton kimi istifadə edilən, bərk cismə toxundurulduqda müəyyən yüksəklikdə səs çıxaran haçaşəkilli kiçik polad alət.

**KAMFORA** [*lat.* əsli *yun.*] bax **kafur.** *Kamfora spirti.* – [Mələk Kərəmə:] *Kamfora vuracağam. Buna keçmişlərdə kafur yağı deyərdilər.* M.İbrahimov.

**KAMIŞİT** [*rus.* əsli qamış-dan] *xüs.* Plitə şəklində preslənmiş qamışdan hazırlanan tikinti materialı. *Kamışit zavodu.*

**KAMİL** *sif.* [*ər.*] 1. Nöqsansız, qüsursuz, bitkin, tam, mükəmməl. *Kamil əsər.* – *Cəmali-batinim kamildi, yox bir zərrə nöqsanı; Nə qəm, ey mahi-bimehrim, gər olsa surətim naqis.* S.Ə.Şirvani. *Olum sadağası bu gözəllərin; Mərifətdə kamil, kamalda dərin.* Aşıq Ələsgər.

2. Kamala yetmiş, kamilləşmiş, yetkin. *Kamil usta. Kamil sənətkar.* // Təcrübəli, mahir. *Yanmaqda kamildir, odda səməndər; Mən özüm bu yolun mərdanəsiyəm.* Q.Zakir. *Maşallah, nə yaxşı qabilsən; Bağçabanlıqda xeyli kamilsən.* A.Səhhət. // İs. mənasında. *Bu hələ kamilləri; Gör nadir cahilləri.* (Ata. sözü). [Əziz bəy:] *Xeyr, hazır deyil, axtarırıq ki, bir kamil tapaq, vəkil tutaq.* M.F.Axundzadə. *Cəng əhməqlə eyləməz aqil; Əqli başında olsa gər kamil.* S.Ə.Şirvani.

**KAMİLCƏ** *sif.* Kamil, mükəmməl, tam, tamam-kamal.

**KAMİLƏN** *zərf* [*ər.*] Tamamilə, bütünlüklə, tamam-kamal.

**KAMİLLƏŞDİRİLMƏ** "Kamilləşdirilmək"dən *f.is.*

**KAMİLLƏŞDİRİLMƏK** "Kamilləşdirmək"dən *məch.*

**KAMİLLƏŞDİRMƏ** "Kamilləşdirmək"-dən *f.is.*

**KAMİLLƏŞDİRMƏK** "Kamilləşmək"dən *icb.*

**KAMİLLƏŞMƏ** "Kamilləşmək"dən *f.is.*

**KAMİLLƏŞMƏK** *f.* Kamil olmaq, kamala yetişmək; yetkinləşmək. *Türk xalqlarının söz sənəti qarşılıqlı mədəni-ədəbi əlaqələr sayəsində zənginləşib kamilləşəcəkdir.* (Qəzetlərdən).

**KAMİLLİK** *is.* Bitkinlik, mükəmməllik, yetkinlik. *Kamilliyə çatmaq.* – *Formanın kamilliyi və əsərin bütün ünsürləri arasındakı bədii vəhdətə gəldikdə isə "Ölülər" Azərbaycan dramaturgiyasının şah əsəri sayıla bilər.* M.İbrahimov.

**KAMPANİYA** [*ital.*] 1. Ümumiyyətlə, bir cəbhədə keçirilən hərbi əməliyyat, müharibə, hərbi yürüş, hərbi səfər. // Hərbi dəniz donanmasının aramsız üzüş və yürüş dövrü. // *məc.* Sözlə, yazı ilə hücum; mübarizə. *..Tiflisdə .. nəşr olunan "Tiflisski listok" adlı bir qəzetdə türk mətbuatının ziddinə bir böyük kampaniya açılmışdı.* C.Məmmədquluzadə. *Mədəniyyət uğrunda çalışmaq birgünlük, biraylıq kampaniya deyil, daimi işdir.* Ə.Sadıq.

2. *məc.* Hər hansı bir mühüm ictimai-siyasi və ya təsərrüfat tədbirini həyata keçirmək üçün müəyyən dövrdə aparılan işlər. *Seçki kampaniyası. Pambıq yığımı kampaniyası.* – [Kosaoğlu:] *Sən yaz əkin kampaniyasının qızğın vaxtında sabotajlıq eləyirsən?!* İ.Şıxlı.

**KAMPANİYAÇILIQ** *is.* İctimai və ya istehsal işində sistemsizlik, plansızlıq. *Kampaniyaçılıqla mübarizə.*

**KAMRAN** *sif.* [*fars.*] *klas.* Kamına (arzusuna, muradına, məqsədinə) çatan; xoşbəxt, bəxtiyar. *Rəvadı bunca çəkim firqətin, axir; Vüsal günləri, ey dust, kamran mən idim..* X.Natəvan. □ **Kamran etmək (eyləmək)** – kamına (arzusuna, muradına, məqsədinə) çatdırmaq, xoşbəxt etmək. **Kamran olmaq** – kamına (arzusuna, muradına, məqsədinə) çatmaq, xoşbəxt olmaq. *İnan, əlbəttə, bir zaman olacaq; Əhli-eşq onda kamran olacaq.* A.Səhhət.

**KAMRANLIQ** *is. klas.* Xoşbəxtlik, bəxtiyarlıq. *Əyyamdən umma mehribanlıq; Bir neçə gün olsa kamranlıq.* Əmani.

**KAMSIZ** 1. *sif.* Kamına yetişməmiş; məqsədinə, arzusuna çatmamış.

2. *zərf* Kamına (məqsədinə, arzusuna) yetişmədən. *Kamsız qalmaq.*

**KAMSIZLIQ** *is.* Kamına, məqsədinə, arzusuna çatmamaq.

**KAMUFLYAJ** *is.* [*fr.*] Müəyyən obyekti gizlətmək üçün onları çeşidli rənglərlə boyama, alalama.

**KAMVOL** [*alm.*] *xüs.* 1. Zərif daranmış. *Kamvol yun.* // Belə daranmış yundan hazırlanmış. *Kamvol parça.*

2. Belə yundan zərif parça hazırlayan. *Kamvol kombinatı.*

**KAMYAB** *is.* [*fars.*] *klas.* Kamına, arzusuna çatan; xoşbəxt, bəxtiyar. ☐ **Kamyab olmaq** – 1) kamına çatmaq, xoşbəxt olmaq. *Aləm oldu şad, bülbül vəsli-güldən kamyab.* S.Ə.Şirvani; 2) kam almaq. *Alçaq ürəklər olmaya mövtinlə kamiyab; Ruhun da, heykəlin də, məzarın da inqilab!* M.S.Ordubadi; 3) fayda götürmək, bəhrəsini götürmək; faydalanmaq. [Kök pişiklər arıq pişiyə deyirlər:] *Aşü plovdan oluruq kamyab; Yağlı fətirlər yeyirik, həm qutab.* S.Ə.Şirvani. [Nəcəf bəy:] *Biri, görürsən, sübhdən axşamadək qarışqa kimi çalışır, .. öz zəhmətinin meyvəsindən kamyab olmayır.* Ə.Haqverdiyev.

**KAMYABLIQ** *is. köhn.* Arzusuna çatma; xoşbəxtlik, bəxtiyarlıq. *Xülasə, ədalət hökmranlığında qurdlar quzu ilə otlayırdı, ümumi xoşbəxtlik, ümumi kamyablıq bərpa idi.* Çəmənzəminli.

**KAN** *is.* [*fars.*] *klas.* Mədən yeri, mədən. *Hər kanda əgərçi ləl çoxdur; Bir ləl ki, layiq ola, yoxdur.* Füzuli. // *məc.* Mənbə, məxəz mənasında. *Söylədi zahid: ey vəfa kanı! Bir qızım var ki, bu cahan canı.* S.Ə.Şirvani. *Onun üçün göz çəkmərəm gözündən; Müştaqəm, ey şəkər kanı, mən sənə.* M.P.Vaqif. // Eyni mənada bəzi tərkiblərdə işlənir. *Kani-hümmət, kani-qeyrət, kani-şəfqət bizlərik.* C.Cabbarli.

**KANAL** [*lat.*] 1. Dəniz, çay və göllər arasında gəmilərin gedib-gəlməsi, habelə suvarma, hidrotexniki və s. məqsədlər üçün çəkilmiş süni su yatağı. *Kanal çəkmək. Samur-Abşeron kanalı. Suvarma kanalı.* – [Tahir:] *Mingəçevirdən böyük kanal ayrılacaq.* M.Hüseyn. *Dəli çaydan səhraya kanallar çəkiləndə; Torpağı əridəndə nəfəsi motorların; Mən də ordaydım, bəli.* S.Rüstəm.

2. *tex.* Hər hansı bir şeyin içində boru şəklində dar uzun boşluq. *Top kanalı. Kabel kanalı.*

3. *anat.* b a x **yol** 5-ci mənada.

4. B a x **yol** 6-cı mənada. *Cürbəcür kanallardan istifadə etmək.*

**KANALCIQ** *is.* Kiçik kanal, dar kanal. *Süxurları təşkil edən dənələr arasında çoxlu xırda boşluqlar var. Bu boşluqlar bir-biri ilə birləşib uzun kanalcıqlar əmələ gətirir.*

**KANALİZASİYA** [*fr.*] *tex.* Çirkli suların axıb getməsi və təmizlənməsi üçün boru və yeraltı kanallar və b. sanitar texniki qurğular sistemi. *Kanalizasiya sistemi. Kanalizasiya çəkmək. Kanalizasiya idarəsi.*

**KANALİZASİYAÇI** *is.* Kanalizasiya işçisi.

**KANALİZASİYALI** *sif.* Kanalizasiyası olan. *Kanalizasiyalı şəhər.*

**KANALİZASİYASIZ** *sif.* Kanalizasiyası olmayan. *Kanalizasiyasız məhəllə.*

**KANALİZÁTOR** [*fr.*] *xüs.* Kanalizasiya işləri mütəxəssisi.

**KANÁPE** [*fr.*] *köhn.* Söykənəcəkli taxt, divan. *Böyükxanım otağın yuxarı başında kanape üzərində uzanaraq ayağının birisini qaldırıb digərinin üstünə qoymuşdu.* M.S.Ordubadi. *Midhəd əfəndi bihuş olaraq kanapenin üzərinə sərildi..* Çəmənzəminli.

**KANÁRYA** [coğr. addan] Otaqda qəfəsdə saxlanılan açıq-sarı rəngli oxuyan quş; sarıbülbül.

**KANÁT** [*rus.*] Liflərdən və ya məftillərdən eşilmiş çox möhkəm yoğun ip (kəndir); buraz. *Polad kanat.*

◊ **Kanat yol** – b a x **yol.**

**KANATÇI** *is. xüs.* Kanat hazırlayan fəhlə.

**KANATÇILIQ** *is.* Kanatçının işi, peşəsi.

**KANDAR** *is.* Qapı ağzı; astana. *Mən otağımın kandarında durub baxırdım.* T.Ş.Simurq. *Açdı Baba müəllim pəncərəni bir anda; Gördü biri yıxılıb qapının kandarında.* B.Vahabzadə.

◊ **Kandarına ayaq basmamaq** – bir yerə daha gəlməmək. [Canbalayev:] *Mənim oğlum sənin evinin kandarına ayaq basmamalıdır.* İ.Hüseynov.

**KANİFÓL** [*lat.* colophonia] İynəyarpaqlı ağacların kitrəsindən hasil edilən, şüşəyəoxşar kövrək maddə (sənayedə yapışqan və izolyasiya materialı kimi, habelə çalğı alətlərinin yayına çəkmək üçün işlədilir). *Kanifol fabriki.*

**KANİFOLLAMA** "Kanifollamaq"dan *f.is.*

**KANİFOLLAMAQ** *f.* Çalğı alətinin yayına kanifol çəkmək. *Skripkanın yayını kanifollamaq.*

**KANİFOLLANMA** "Kanifollanmaq"dan *f.is.*

**KANİFOLLANMAQ** *məsh.* Kanifol çəkilmək (çalğı alətinin simlərinə).

**KANİSTR** *is.* [*ing.*] Maye tökmək üçün germetik ağızlı qab.

**KANKAN** *is.* [*fars.*] *köhn.* Əl ilə quyuqazan; quyuçu. *Kankanın vəsiyyəti qızıl öküzdür.* (Ata. sözü). [Məmməd:] *Atam kankan idi, amma acından ölməmək üçün arpa əkirdi.* C.Cabbarlı. *Əzablar içində bağrı qan oldu; Çox gəzib, axırda bir kankan oldu.* M.Rahim.

**KANKANBAŞI** *is. köhn.* Kankanların başçısı. *Qoca kankanbaşı son nəfəsində bərk dolub qəhərləndi.* S.Rəhimov.

**KANKANLIQ** *is.* Kankanın işi, sənəti, peşəsi; quyuçuluq. [Məşədi Hənifə] *yayda biçinə gedər, qışda kankanlıq edər, payız vaxtı karxanalarda günəmuzd kərpic kəsərdi.* Mir Cəlal. [Qulaməli] *özü kankanlıq edib quyu qazdı.* Ə.Sadıq.

**KANÓE** [*isp.*] Xüsusi tipli idman qayığı (bu qayıqda bir diz üstə durub sərbəst avarla avar çəkilir).

**KANONADA** [*fr.*] 1. Toplardan tez-tez və ardıcıl açılan atəş.

2. Top atəşlərinin və mərmi partlayışlarının uzaqdan eşidilən səsi.

**KANONÉR** [*fr.* canoniere-dən]: **kanoner qayığı** – b a x **kanonerka.**

**KANONERKA** [*fr.*] Dənizin sahilboyu ərazilərində, çaylarda və göllərdə hərbi əməliyyat aparmaq üçün döyüş gəmisi; kanoner qayığı. *Raket silahının inkişafı ilə əlaqədar kanoner qayığının rolu xeyli azalmışdır.*

**KANSELYARİYA** [*lat.*] b a x **dəftərxana.** [Məmmədcəfər] *kanselyariyada oturanda başını çox vaxt dala əyərdi.* Qantəmir.

**KÁNSLER** [*alm.*] Bəzi dövlətlərdə yüksək vəzifəli şəxslərə verilən ad və bu adı daşıyan şəxs. // Almaniyada baş nazir.

**KANTÁTA** [*ital.*] 1. Musiqinin müşayiəti ilə xorla və tək oxunan, adətən təntənəli mahiyyət daşıyan böyük musiqi əsəri. *"Füzuli" kantatası. – Simfonik vokal əsərlər formasından biri də kantatadır.* Ə.Bədəlbəyli.

2. Təntənəli xor havası.

3. Hər hansı bir təntənəli hadisə münasibətilə yazılmış qədim lirik şeir.

**KANTÓN** [*fr.*] Bəzi xarici ölkələrdə inzibati-ərazi bölgüsü.

**KANYÓN** *is.* [*isp.*] Sıldırımlı dar dərə.

**KAP** *is. məh.* Qarğıdalı, alma və b. meyvələrin yeyilməyən hissəsi, qalığı.

**KAPELLA** [*orta lat.*] *mus.* Müğənnilərdən və musiqi alətlərində çalan çalğıçılardan ibarət ansambl. *Banduraçılar kapellası.* // Müğənnilərdən ibarət xor. *Dövlət Akademik Kapellası.*

**KAPELMÉYSTER** [*alm.*] Keçmişdə dirijora verilən ad. // Hərbi orkestr dirijoru.

**KAPELMEYSTERLİK** *is. köhn.* Dirijorluq.

**KAPİLLYAR** [*lat.*] *anat.* Ən kiçik, incə qan damarı. *Kapillyar damarlar.*

**KAPİTÁL** [*lat.* capitalis-dən] 1. *iqt.* Sahibinə, muzdlu fəhlələri istismar yolu ilə izafi dəyər gətirən dəyər (sərmayə, istehsalat vasitələri və s.). *Maliyyə kapitalı. Sənaye kapitalı. – Sorulub Bakının şah damarları; Nobel banklarında kapital oldu.* M.Araz. // *top.* Kapitalistlər, burjua sinfi, kapitalizm. *Kapital ölkələri. Kapital ilə zəhmətin mübarizəsi. Kapital hakimiyyəti. Beynəlxalq kapital. – Basmış kapitalın ürəyini yağ; Gənclik sürətindən qalmış ayağı.* S.Vurğun.

2. Sərmayə, sərvət, dövlət, mal-mülk, əmlak.

3. *dan.* Çoxlu miqdarda pul.

4. *məc.* Ümumiyyətlə, ən dəyərli, ən qiymətli, ən əhəmiyyətli şey.

◊ **Kapital qoyuluşu** – əsaslı inşaat üçün buraxılan pullar.

**KAPİTALİST** *is.* 1. Kapitalizm cəmiyyətində hakim sinfin nümayəndəsi, muzdlu fəhlələri istismar edən kapital sahibi.

2. B a x **kapitalizm** 2-ci mənada. *Kapitalist istehsal üsulu.*

3. *köhn.* Çox varlı, dövlətli adam; sərmayədar.

**KAPİTALİZM** [*lat.*] 1. İstehsal vasitələri üzərində xüsusi mülkiyyətə və muzdlu əməyin istismarına əsaslanan ictimai-iqtisadi formasiya. *Marksın "Kapital" əsərində kapitalizmin iqtisadi qanunlarının elmi təhlili verilmişdir.*

2. Kapitalizm prinsipləri əsasında qurulmuş, kapitalizmə xas olan. *Kapitalizm cəmiyyəti. Kapitalizm istismarı.*

**KAPİTALLAŞDIRILMA** "Kapitallaşdırılmaq"dan *f.is.*

**KAPİTALLAŞDIRILMAQ** *məch. iqt.* Kapitala çevrilmək.

**KAPİTALLAŞDIRMA** "Kapitallaşdırmaq"dan *f.is.*

**KAPİTALLAŞDIRMAQ** *f. iqt.* Kapitala çevirmək.

**KAPİTALLAŞMA** "Kapitallaşmaq"dan *f.is.*

**KAPİTALLAŞMAQ** *f. iqt.* Kapitala çevrilmək.

**KAPİTAN** [*fr.*] 1. Orduda: baş leytenant rütbəsindən sonra gələn zabit rütbəsi, habelə bu rütbəni daşıyan şəxs. *Komandir, Əliyev adlı bir azərbaycanlı kapitan idi.* Mir Cəlal.

2. Gəmi komandiri, rəisi. *Gəmi kapitanı. Kapitan köməkçisi. – Dalğalar qayığı nə qədər sağa-sola çırpdısa da kapitanın halına təfavüt eləmədi.* M.Hüseyn. *Kapitan gəminin nə qabağa, nə dala getməsinin mümkün olmadığını deyib, lövbər atılmağını əmr etdi.* Ə.Haqverdiyev.

3. İdman komandasının başçısı. *Futbol komandası kapitanı.*

◊ **Kapitan-leytenant** – donanmada baş leytenantdan sonra gələn zabit rütbəsi və bu rütbədə olan şəxs.

**KAPÓT** [*fr.*] 1. *köhn.* Evdə geyilən xalata oxşar enli qadın paltarı. *Maşa şalına büründü, isti kapot geyindi, öz mücrüsünü götürüb dal qapıya çıxdı.* Puşkindən.

2. Müxtəlif mexanizmlərdə (məs.: avtomobildə, təyyarədə) açılıb-bağlanan metal örtü.

**KAPRÁL** [*fr.*] *köhn. hərb.* Bəzi ölkələrin ordularında və XVII əsrdən XIX əsrin birinci yarısına qədər rus ordusunda kiçik komanda heyətinə məxsus hərbi rütbə və bu rütbəni daşıyan şəxs; onbaşı. [P.A.Qrinyov] *evdən çıxmaq üzrə ikən qapı açıldı; kapral içəri girib, .. qala ətrafında naməlum adamların dolaşdığını xəbər verdi.* Puşkindən.

**KAPRÍÇÇİO, KAPRİÇÇO** [*ital.*] *mus.* Sərbəst və oynaq musiqi əsəri. *Fikrət Əmirovun "Azərbaycan" kapriççiosu.*

**KAPRÓN** [*xar.*] Süni lif növü. *Kapron istehsalı.* // Kaprondan hazırlanmış. *Kapron corab. Kapron tor. Kapron ip.*

**KÁPSUL¹** [*lat.*] *əcz.* Birdəfəlik dərman dozası üçün jelatindən, kağızdan və s.-dən qayrılmış, mədədə tez həll olunan qovuqcuq.

**KÁPSUL²** [*fr.*] Piston (patronda, distansiya borucuqlarında və s.-də).

**KAPSULLU¹** *sif.* Kapsula qoyulmuş. *Kapsullu dərman.*

**KAPSULLU²** *sif.* Kapsulu olan. *Kapsullu tüfəng.*

**KAPTÁJ** [*fr.*] *xüs.* 1. Yer altından çıxan mədən suyunun, yaxud qazın torpağa hopmasının, axarkən çirklənməsinin qarşısını almaq və onlardan daha səmərəli istifadə məqsədilə onların boru, quyu və s. qurğu içinə alınması.

2. Mədən suyu, qaz və s. çıxan yerin üstündə qurulan qurğu.

**KAPTENARMUS** [*fr.*] *köhn.* Hərbi hissədə silah, ərzaq və sursata baxan şəxs.

**KAPYUŞÓN** [*fr.*] Üst paltara bənd edilmiş başlıq.

**KAR¹** *sif.* Eşitmək qabiliyyətini tamamilə və ya qismən itirmiş. *Kar kişi. Bir qulağından kar. Anadangəlmə kar.* – [Cahangir:] *Qışqırmayın, mən kar deyiləm!* İ.Əfəndiyev. // *İs. mənasında.* Qulağı eşitməyən adam. *Karın könlündəki. – Kar iki dəfə gülər.* (Ata. sözü). // *məc.* Laqeyd, heç bir şey eşitmək istəməyən adam haqqında. *Elə bil kardır, söz eşitmir.*

◊ **Kar samit** *dilç.* Səs tellərinin iştirakı olmadan tələffüz edilən samit.

**KAR²** *is.* [*fars.*] 1. İş, peşə, məşğələ. *Nə karın sahibidir? Hansı kar yiyəsidir? – Qoç Koroğlu öz karında; Yalan olmaz ilqarında.* "Koroğlu". *Qoy mən tox olum, özgələr ilə nədi karım.* M.Ə.Sabir. *Yox quru fəxr eləməkdən bizə hərçəndi səmər; Karımız yox, əlimizdən nə gəlir özgə hünər?* Ə.Nəzmi.

2. Təsir. *Zəxmi-sitəmin olmadı bu Seyyidə kari; Səd heyf, səd əfsus, günahkar ölürəm mən.* S.Ə.Şirvani.

◊ **Kar aşmamaq** – nəticə hasil olmamaq, işə yaramamaq, bir nəticə çıxmamaq. *Nə qılıncdan kar aşmadı, nə nizədən iş çıxmadı.* "Koroğlu". *Bülbül dedi: – Bunlar ilə kar aşmaz; Bu baş-qulaq kamançaya yaraşmaz.* A.Səhhət. *Özgəyə ümid olmaq; Bizim üçün yaraşmaz; Özgənin köməyilə; İnsan üçün kar aşmaz.* B.Vahabzadə. **Kar etmək (eləmək)** – təsir etmək, təsirini göstərmək. *Arsıza bir sillə kar eləməz.* (Ata. sözü). *Xudayar katdaya aclıq çox kar eləmişdi.* C.Məmmədquluzadə. [Hacı Murad:] *Sənə söz kar eləmir.* S.S.Axundov. **Kar gətirmək** – işə yaramaq, xeyir gətirmək. **Kar görmək** – b a x **kara gəlmək**. [Əsir:] *Nə qədər qışqırdı, nərə vurdu, qoşun kar görə bilmədi.*

Ə.Haqverdiyev. *Əbişin gözləri çanağından çıxmaq dərəcəsinə gəlmişdi. O, kar görməyən top açarları qaldırıb* [yerə] *çırpdı..* S.Rəhimov. **Kar salmaq** – b a x **kar etmək.** *Padşahın gözləri tutulur, .. təbib, dərman qalmır, hamısını eləyirlər, kar salmır ki, salmır.* (Nağıl). *Amma* [molla] *hər nə deyirsə, heç biri kar salmır.* "M.N.lətif." **Kar vermək** – əlverişli olmaq, işə yaramaq, faydası olmaq. [Xırdaxanım:] *Nurcahan, bizə yatmaq kar verməz.* N.Vəzirov. **Kara düşmək** – b a x **kara gəlmək**. **Kara gəlmək** – işə yaramaq, lazım olmaq; köməyi, xeyri dəymək. [Molla Kazım:] *Camaatın karına gəlirəm.* Ə.Haqverdiyev. *Usta Qiyas bir bükülü pulu* [Kərimin] *qabağına qoyur: – Kasıb yaşayırsan, kara gələr.* M.İbrahimov. **Kardan düşmək** – işdən düşmək, yararsız hala gəlmək. *İşləməyən kotan pas atar və kardan düşər..* M.İbrahimov. **Karına gəlmək** – işinə yaramaq, köməyi olmaq. [Rüstəm:] *Pristav yox, kətxuda da yox, adam döyən, camaat incidən yox, camaatın karına gələn bir adam olsun.* S.Rəhimov. *Söhbət lampa şüşəsinə çatanda mən tavandan sallanan elektrik lampasını göstərib soruşdum: – Niyə, bu, karınıza gəlmir?* R.Rza.

**KARABİN** [*fr.*] Qısalüləli tüfəng. [Səttarxan] *qısaqundaqlı bir Avstriya karabini götürmüşdü.* P.Makulu.

**KARABİNYER** [*fr.*] 1. Keçmişdə Qərbi Avropada və XIX əsrin ortalarına qədər Rusiyada: karabinlə silahlanmış xüsusi hərbi hissələrə mənsub əsgər.

2. İtaliyada: jandarm.

**KARAGƏLƏN** *sif.* İşə yarayan; köməyi, xeyri dəyən, gərəkli. *Karagələn adam. – Qədir paketin birisini açdı və dedi: –* [Bayram] *karagələn adamdır.* Ə.Vəliyev.

**KARAİM** *is.* Krımda və Litvada, habelə Polşada yaşayan türkdilli xalq və bu xalqa mənsub adam.

**KARAMÉL** [*fr.*] Şəkər və patkadan hazırlanan ətirli, rəngli konfet növü. *İçli karamel. Karamel konfeti. Karamel fabriki.*

**KARANDÁŞ** *is.* [*rus.* əsli "qara daş" sözündən] Yazı yazmaq, şəkil və cizgi çəkmək üçün taxtaya geydirilmiş nazik qrafit, yaxud quru boyaq çubuğu. *Qara karandaş. Qırmızı karandaş. Karandaşla yazmaq. – Çernil, qrafit, pero, karandaş; İcad edəni olaydı şil, kaş!* M.Ə.Sabir. *Xətayinin qılıncını suvardım; Məmməd Araz karandaşı göyərdi.* M.Araz.

**KARANTÍN** [*fr.*] 1. Yoluxucu xəstəliklərin daha da yayılmasının qarşısını almaq üçün xəstələrin və onlarla təmasda olmuş şəxslərin müvəqqəti təcrid edilməsi. *Karantin qoymaq. Karantində olmaq* (*saxlamaq*). *Karantin müddəti.*

2. Epidemiya olan yerdən gələn şəxsləri, gəmiləri və malları yoxlamaq üçün səhiyyə məntəqəsi.

**KARASTI** *is.* 1. Bir şey qayırmaq üçün lazım olan əl aləti. *Qonşuya karastı verməyən məhşərə qolsuz gələr.* (Ata. sözü). *Bütün emalatxanaların maşın və karastıları dağılmışdı.* M.S.Ordubadi. *Dəmirçi gətirdiyi karastılarla Həmzənin mağazasının enli, qalınpolad qurşağını, kilidlərini qoparmağa başladıqda Zeynal astadan Veysə dedi.* Ə.Əbülhəsən.

2. *dan.* Silah.

**KARAT** *is.* [ərəbcədən] *xüs.* Qiymətli daşların 200-206 mq-a bərabər çəki ölçüsü.

**KARATE** *is.* [*lat.*] 1. Özünü müdafiə sistemi.

2. Güləş növü.

**KARATLIQ** *sif.* Saylara qoşularaq karatın miqdarını göstərir (b a x **karat**). *İki karatlıq brilyant. – Bu təntənəyə İran şahzadəsi .. 12 karatlıq bir brilyant üzüyü də .. satıb xərc etmişdi.* M.S.Ordubadi.

**KARBÍD** [*lat.* carbo – kömür və *yun.* eidos növ] *kim.* Karbonun bəzi metal və metalloidlərlə birləşməsi. *Dəmir karbidi.* ◻ **Karbid lampası** – suyun kalsium karbidə təsiri nəticəsində alışan asetilenlə yanan lampa.

**KARBÓL** [*lat.*]: **karbol turşusu** – spesifik iyi olan zəhərli dezinfeksiya maddəsi – fenol karbol məhlulu.

**KARBÓN** [*lat.*] Təbiətdə bütün üzvi maddələrin ən mühüm tərkib hissəsi olan kimyəvi element. *Radioaktiv karbon. Sulu karbon. – Canlının bədənini təşkil edən kimyəvi elementlər içərisində mühüm yer tutan elementlərdən biri karbondur.* M.F.Axundzadə.

**KARBONÁR(İ)** [*ital.* carbonaro] XIX əsrin əvvəllərində İtaliyada meydana gəlmiş, yadellilərin zülmünə qarşı və İtaliyanın birləşməsi uğrunda mübarizə aparan gizli cəmiyyətin üzvü.

**KARBONÁT** [*lat.*] 1. *kim.* Karbon turşusu duzu (soda, potaş və s).

2. *kim. geol.* Tərkibində karbon turşusu olan mineralların adı.

3. *xüs.* Xırda dənəli qara almaz (quyu qazma, cilalama və s. işlərdə işlənir).

**KARBONATLI** *sif. xüs.* Tərkibində karbonat olan. *Karbonatlı süxurlar.*

**KARBONATLILIQ** *is. xüs.* Bir şeydə (süxurda və s.-də) olan karbonatın dərəcəsi. *Torpağın karbonatlığı.*

**KARBONLAŞDIRILMA** "Karbonlaşdırılmaq"dan *f.is.*

**KARBONLAŞDIRILMAQ** *məch. xüs.* Karbon hopdurulmaq, karbon qazı ilə doyuzdurulmaq.

**KARBONLAŞDIRMA** "Karbonlaşdırmaq"dan *f.is.*

**KARBONLAŞDIRMAQ** *f. xüs.* Karbon qazı hopdurmaq, karbon qazı ilə doyuzdurmaq.

**KARBONLU** *sif. xüs.* Tərkibində karbon olan, karbon qarışdırılmış.

**KARBÜRASİYA** [*fr.*] *xüs.* Daxili yanacaqlı mühərriklərdə duru yanacaq ilə havanın qarışmasından yanacaq qatışığı əmələ gəlməsi. *Karbürasiya etmək.*

**KARBÜRÁTOR** [*fr.*] *xüs.* Daxilində karbürasiya əmələ gələn cihaz (daxili yanacaqlı mühərriklərdə).

**KARBÜRATORLU** *sif.* Karbüratoru olan. *Karbüratorlu motor.*

**KARDİNÁL** [*lat.*] Katolik kilsəsində yüksək (papadan sonra birinci) ruhani rütbəsi, habelə bu rütbəni daşıyan şəxs. *Kardinal rütbəsi.*

**KARDİNALLIQ** *is.* Kardinal rütbəsi, vəzifəsi.

**KARDİÓQRAF** [*yun.* kardia – ürək və grapho – yazıram] *xüs.* Ürək fəaliyyətini yazmaq üçün cihaz.

**KARDİÓQRAFİYA** [*yun.* kardia – ürək və grapho – yazıram-dan] *tib.* Kardioqraf vasitəsilə ürək fəaliyyətinin yazılması.

**KARDİOQRÁM** [*yun.* kardia – ürək və gramma – yazı] *xüs.* Ürək fəaliyyətinin qrafik təsviri.

**KARDİOLÓGİYA** [*yun.* kardia – ürək və logos – elm] Tibb elminin ürək xəstəliklərini tədqiq edən bölməsi.

**KARDİOLOJÍ** *sif. tib.* Ürəyə aid olan. // Ürək xəstəliklərinin müalicəsi üçün olan. *Kardioloji sanatoriya.*

**KARDİÓLOQ** [*yun.* kardia – ürək və logos – elm-dən] Ürək xəstəlikləri mütəxəssisi olan həkim.

**KAREL** Kareliyanin əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Karel dili. Karel ədəbiyyatı.*

**KARÉT(A)** [*pol.*] *köhn.* Hər tərəfi örtülü, dördtəkərli, at qoşulan, yaylı minik arabası. *Atın köhləni ancaq minik üçün və ya müzəyyən faytonlara və karetalara qoşulmaq üçün saxlanılır.* Ə.Haqverdiyev. [Ana:] *Qızım karet içində, üzündə duvaq, yanında sağdışı, soldışı otursun.* A.Şaiq. *Aparsın mənzilə bizi kareta; Orda bir gecəlik qonağım ol sən.* S.Vurğun. *Şaxtalı küçələrdən keçirdi karetalar.* R.Rza.

**KARƏ** [*fars.*]: **nə karəsən?** – nəçisən? nə işin sahibisən? [Gənc:] *Kimsən, nə karəsən, bilmirəm, mənim sirrimə əl aparma!* Çəmənzəminli. **Nəkarədir** – nəçidir, kimdir, nə ixtiyarı var, nə haqqı var. *Nə Leyli sən kimi olmuş, nə mən kimi Məcnun; Nəkarədir gəlib onlar bizə bərabər ola?!* Ə.Vahid.

**KARGAH** *is.* [*fars.*] Xalça, palaz və s. toxumaq üçün çərçivə şəklində qurğu; hana, dəzgah. ◻ **Kargah toxumaq** – hanada xalça, palaz və s. toxumaq. *Yar durub kargah toxuyur; Nəfəsi ənbər qoxuyur.* Aşıq Əli.

**KARGƏR** *is.* [*fars.*] *köhn.* Fəhlə, əmələ, işçi. *Atam əllaf, babam dülgər idi; Qardaşım culfa, əmim kargər idi.* M.Ə.Sabir. [Biluri:] *Həqiqət və namus ancaq rəncbərdə və kargərin həyatında qalıb, heyif ki, onların da ürəyi əli kimi kobuddur.* M.İbrahimov. // Usta köməkçisi.

**KARGİR** *is.* [*fars.*] *köhn.* Təsir, əlac. ◻ **Kargir olmaq** – təsir etmək, əlac etmək. *Bir gün də miraxur gəlib xəbər verdi ki, xanın çox istədiyi kürən atı bir sancı tutub, hər nə edilirsə, kargir olmur.* Ə.Haqverdiyev.

**KARGÜZAR** *is.* [*fars.*] İdarə və s.-də dəftərxana işlərini aparan xidmətçi; işlər müdiri. *Kargüzarı çağırıb, onlara vəzifə verəcəyini düşünərək tələbələr çox məmnun oldular.* A.Şaiq. *Kargüzar olmusan, müxbir olmusan; Ey qoca müəllim, ey möhkəm insan!* M.Müşfiq. *Kargüzar, qardaşına toy etmək üçün icazə alıb kəndə getmişdi.* S.Rəhman.

**KARGÜZARXANA** *is.* [*fars.*] *köhn. kit.* Dəftərxana. *Molla əmi, .. bizim kargüzarxanamız keçəcəkdə də vətənə çox xidmət edib.* C.Məmmədquluzadə.

**KARGÜZARLIQ**[1] *is.* Kargüzarın işi, məşğuliyyəti, vəzifəsi. *Kargüzarlıq vəzifəsi.* // Dəftərxana işləri. □ **Kargüzarlıq etmək** – dəftərxana işlərini aparmaq.

**KARGÜZARLIQ**[2] *is. köhn.* Kömək, yardım. □ **Kargüzarlıq etmək (buyurmaq)** – kömək etmək. [Əhməd:] *..Gərək siz bu bəyə lazımınca kömək edəsiniz, işlərinə kargüzarlıq buyurasınız.* N.Vəzirov.

**KARXANA** *is.* [*fars.*] 1. *köhn.* Fabrik, zavod, emalatxana. *Çit karxanası. – Kitayda yapon malı baykot edilib, yapon karxanalarını işsiz qoyublar.* C.Məmmədquluzadə. *Hər səhər günçıxanda karxana irili-xırdalı yüzlərlə oğlan və qız uşağı ilə dolurdu.* Ə.Məmmədxanlı. *İmaməlini xalça karxanasına şagird qoymuşdular.* Ə.Sadıq.

2. Daş çıxarılan yer (adətən "daş karxanası" şəklində). *Siz hər gün limana gələn gəmilərin sayını öyrənib, balaca bir kağıza yazarsınız, sonra şəhərin kənarındakı daş karxanasına göndərərsiniz.* M.Hüseyn.

3. Əhəng yandırılan yer.

**KARXANAÇI** *is. köhn.* Karxana sahibi. *Karxanaçı "qibleyi-aləm" sözünü eşidər-eşitməz titrəməyə başladı.* Çəmənzəminli.

**KARXANAÇILIQ** *is. köhn.* Karxana sahibliyi.

**KARIXDIRICI** *sif.* Karıxdıran, fikri çaşdıran. *Karıxdırıcı vəziyyət. Karıxdırıcı sual.*

**KARIXDIRILMA** "Karıxdırılmaq"dan *f.is.*

**KARIXDIRILMAQ** "Karıxdırmaq"dan *məch.*

**KARIXDIRMA** "Karıxdırmaq"dan *f.is.*

**KARIXDIRMAQ** *icb.* Çaşdırmaq, fikrini çaşdırmaq. *Gözləmədiyi bu ataş düşməni elə karıxdırdı ki, .. yerə sinmək belə yadına düşmədi.* Ə.Əbülhəsən. [İsmayıl:] *Heç olmasa iki dəstəyə bölünüb, onları iki tərəfdən karıxdırmalıyıq.* P.Makulu.

**KARIXMA** "Karıxmaq"dan *f.is.*

**KARIXMAQ** *f.* Çaşmaq, çaşıb qalmaq, özünü itirmək, nə edəcəyini, nə deyəcəyini bilməmək. *Məmmədhəsən əmi lap karıxdı..* C.Məmmədquluzadə. *Evdən çölə çıxdı Sona darıxmış; Yolun o tayına keçdi karıxmış.* H.K.Sanılı. *Heç vaxt karıxmayan bir müəllimin; Ağzında ilk dəfə dolaşır sözü.* H.Arif.

**KARİKATUR** [*ital.*] 1. Bir şəxsi və hadisəni qəsdən gülünc surətdə təsvir edən şəkil. *Gülməli karikatura. – Qəzetin birinci səhifəsində çəkilmiş karikaturada ağ bir qoyun göy çəmənlikdə ot qırpırdı, amma sağında və solunda iki boz qurd şöngüyüb göz-gözə oturmuşdu..* Ə.Məmmədxanlı. [Rəssam:] *Mən* [Şahinin] *karikaturasını çəkməsəm, adımı dəyişib rəngsaz qoyaram.* S.Rəhman. // İncəsənətin digər növləri vasitəsilə verilən bu cür şəkil, habelə bu mahiyyətdə olan əsərlər haqqında. *Bu təsvir deyil, karikaturadır.*

2. Bir şeyin gülünc, miskin bənzəri (adətən müqayisə məqamında). *Hitler Napoleonun karikaturasıdır.* M.Hüseyn.

**KARİKATURALAŞDIRILMAQ** "Karikaturalaşdırılmaq"dan *f.is.*

**KARİKATURALAŞDIRILMA** *məch.* Karikatura halına salınmaq, gülünc şəkildə təsvir edilmək (göstərilmək).

**KARİKATURALAŞDIRMA** "Karikaturalaşdırmaq"dan *f.is.*

**KARİKATURALAŞDIRMAQ** *f.* Karikatura şəklinə salmaq, gülünc şəkildə təsvir etmək (göstərmək).

**KARİKATURÇU** *is.* Karikatura çəkən rəssam.

**KARİKATURÇULUQ** *is.* Karikaturaçının işi, sənəti, karikatura çəkmə.

**KARİKATURLU** *sif.* Karikaturası olan, karikatura çəkilmiş. *Karikaturalı jurnal.* – [Dilbər] *kənd məktəbindəki rəsm müəllimi-nin köməyi ilə həftədə bir nömrə şəkilli, karikaturalı iri qəzet hazırlayıb çardaqdan asırdı.* Ə.Sadıq.

**KARİYES** *is.* [*lat.*] Sümüyün və ya dişin iltihablı dağımı, çürüməsi.

**KARKÁS** [*ital.* carcassa] Bina və s.-nin dəmirdən düzəldilən gövdəsi, skeleti. *Çoxmərtəbəli evin karkası.* // Parçadan düzəldilən bəzi məmulatların məftil skeleti, əsası. *Abajurun karkası.*

**KAR-KOR** *is.* Həm qulağı eşitməyən, həm gözü görməyən adam.

**KARKÜN** *sif.* [*fars.*] *köhn.* 1. İşcil, işlək, işləyən, işgüzar, işbacaran. [Fərmanın] *qəsdi özünün karkün olmasını həm əmisinə, həm də Gövhərtaca göstərmək idi.* Ə.Haqverdiyev. *..Babakişi çox karkün adam idi.* S.Rəhimov.

2. Başqasına əl tutan, kömək edən, işə yarayan. *Karkün adam.*

**KARKÜNLÜK** *is. köhn.* İşcillik, işləklik, işgüzarlıq. *İçəriyə qoltuğu portfelli, üzündən-gözündən süni karkünlük tökülən bir tələbə girdi.* Çəmənzəminli.

**KAR-LAL** *is.* Həm eşitmək, həm də danışmaq qabiliyyətindən məhrum adam. *Karlallar məktəbi.*

**KARLAŞMA** 1. "Karlaşmaq"dan *f.is.*

2. *dilç.* Səs tellərinin iştirakı olmadan tələffüz edilmə.

**KARLAŞMAQ** *f.* 1. Kar olmaq, eşitmək qabiliyyətini itirmək.

2. *dilç.* Səs tellərinin iştirakı olmadan tələffüz edilmək.

**KARLI** *sif.* 1. Yararlı, işəyarar, karagələn. *Karlı adam. – Bu davada onlardan on nəfərdən çox karlı adam ölmüşdü.* "Qaçaq Nəbi". *Tapançalardan hansı daha karlıdır?* A.Şaiq. // *məc*. Güclü, böyük, möhkəm, bərk, təsirli. *Karlı yara. Karlı yumruq. Karlı söz. – Gec kəsər, karlı* (z.) *kəsər; Bir məzlumun ahı səni.* (Ata. sözü).

2. Xeyirli, faydalı, qazanclı, istifadəli. [Qədir:] *Cibim boş, ümid yerim yox! Zəmanə şuluqluq, .. bir karlı iş yox, filan yox!* Mir Cəlal.

3. İşbacaran, işgüzar; daha bacarıqlı, daha işlək. *Həcərin karlı qardaşları vardı.* "Qaçaq Nəbi". [Rzaqulu:] *..Bir azca hələ bəlkə mən ondan karlıyam da. Nöşün o olsun, mən olmayım?* N.Vəzirov.

**KARLIQ** *is.* Eşitmə qabiliyyətinin olmaması və ya nöqsanlı olması. *Dil açmada karlıq da gedər, korluğumuz da; Çünki lallığımız doğmuş idi karlığımızdan.* Şəhriyar. ☐ **Özünü karlığa vurmaq (qoymaq)** – özünü kar kimi, eşitməyən kimi göstərmək. *Nəbi özünü karlığa vurub, ona yaxın gəlməsini əli ilə işarə edir.* "Qaçaq Nəbi".

**KARLILIQ** *is.* İşə yararlıq, gərəklilik, faydalılıq.

**KARNAVAL** [*ital.*] Çox vaxt açıq havada oyunlarla, rəqslərlə, maskalarla və xüsusi geyimlərlə keçirilən xalq şənliyi – maskarad.

**KARNİZ** [*alm.* əsli *ital.*] 1. *memar.* Divarın yuxarı hissəsini tamamlayan, yaxud qapı, pəncərə üstündən uzanan horizontal çıxıntı. *Üz tutdum o yüksək saraya doğru; Çıxdım pilləkəndən üzüyuxarı; Karnizlər tökülüb diş-diş görünür; Bizdəki qəflətə sanki o gülür.* Şəhriyar.

2. Pəncərə və ya qapı üstündən pərdə asmaq üçün divara bənd edilən metal və ya ağac mil.

**KAROTİN** *is.* [*lat.*] "A" vitamini.

**KARP** *zool.* Üstündə iri, tünd-qızılı pulları olan, şirin su balığı.

**KARPKİMİLƏR** *cəm zool.* Əsasən şirin sularda yaşayan balıqlar (məs.: çəki, çapaq və s.) ailəsi.

**KARSALA** *sif. dan.* 1. Qulağı ağır eşidən.

2. Key, huşsuz, duyğusuz; zehni kütləşmiş, korazehin.

**KARSALALIQ** *is. dan.* 1. Qulağı ağır eşitmə.

2. Keylik, huşsuzluq, duyğusuzluq; zehinsizlik, korazehinlik.

**KARSALAMA** "Karsalamaq"dan *f.is.*

**KARSALAMAQ** *f. dan.* Qulağı bir qədər karlaşmaq, qulağı ağır eşitməyə başlamaq.

**KARSAZ** *sif.* [*fars.*] *köhn.* İş görən, işbacaran, bacarıqlı, işgüzar.

**KARSAZLIQ** *is. köhn.* İşcillik, bacarıqlılıq, işgüzarlıq. ☐ **Karsazlıq etmək (eləmək)** – 1) işə yaramaq, kömək etmək, yararlıq göstərmək, xeyri olmaq; 2) kömək etmək, yardım etmək. [Məşədi Tağı:] *..Allah qoysa, sizə çox-çox karsazlıq edəcəyəm, ancaq bir dəfə lazımınca səy eləyin.* N.Vəzirov. *O da kimə əlli manat, yüz manat barama vaxtına, buğda vaxtına, ya üzüm vaxtına pul karsazlıq eləyərdi.* Ə.Haqverdiyev.

**KÁRSER** [*lat.*] Müqəssirin müvəqqəti saxlandığı biradamlıq otaq. *Karserə salmaq.*

**KARSIZ** *sif.* Gərəksiz, işə yaramayan. *Bağçasız, bağsız dağlar; Dumansız, qarsız dağlar; Mən sizə arxalandım; Siz olduz karsız* (z.), *dağlar!* (Bayatı). *Mən hərdən oturub fikirləşirəm və bu əqidəyə gəlirəm ki, bizim çoxumuzu bədbəxt edən karsız, vecsiz və xeyirsiz qohumlarımızdır.* Ə.Vəliyev.

**KARSIZLIQ** *is.* Gərəksizlik, işə yaramama. *..Çox ittifaqlarda inspektor, direktor ..* [müəllimlərin] *tənbəlliyindən və karsızlığından şikayət edirlər.* F.Köçərli. *Çəpəl fəndinin karsızlığını, bu müvəffəqiyyətsizliyini onunla izah edirdi ki, bəyin inamı düz deyil.* Mir Cəlal. ☐ **Karsızlıq etmək** – zəiflik göstərmək, heç bir təsir göstərə bilməmək.

**KART** [*alm.* əsli *ital.*] 1. Hər birinin dörd növü olmaqla, üzərindəki şəkil və işarələrlə bir-birindən fərqlənən qumar kağızlarının hər biri, qumar kağızı. *Kart vermək. Kart almaq. Kart paylamaq. – Mehriban səfillər, kefləri çağdır; Kart masa üstündə daraq-daraqdır.* M.Müşfiq.

2. Həmin kağızlarla oynanılan oyun. *Kart oyunu. Kartda udmaq. Kartda bəxti gətirmək. Kart oynamaq.* ☐ **Kart çəkmək** – oyun zamanı kartların içərisindən bir və ya bir neçəsini çəkib götürmək. **Kart vurmaq** – kartla oyun (qumar) oynamaq. [Nəbi:] [Bəylər] *çox vaxt gecəni gündüzə qatıb o biri günə kimi kart vururlar.* S.S.Axundov.

◊ **Kart basmaq** – aldatmaq, hiylə işlətmək, kələk gəlmək.

**KARTEÇ** is. [*rus.*] 1. İçi xırda güllələrlə doldurulmuş top mərmisi.

2. İri qırma.

**KARTEL** [*fr.*] *iqt.* Birlikdə öz ticarət və istehsal müstəqilliyini saxlayan inhisar formalarından biri. *Kartel şəraitində birləşmiş müəssisələr öz ticarət və istehsal müstəqilliyini saxlayır.*

**KARTELLƏŞDİRİLMƏ** "Kartelləşdirilmək"dən *f.is.*

**KARTELLƏŞDİRİLMƏK** *məch. iqt.* Kartel şəklində birləşdirilmək, birləşdirilərək kartel düzəldilmək.

**KARTELLƏŞDİRMƏ** "Kartelləşdirmə"dən *f.is.*

**KARTELLƏŞDİRMƏK** *f. iqt.* Birləşdirib kartel düzəltmək, kartel şəklində birləşdirmək (sənaye müəssisələrini).

**KARTER** *is.* [*ing.*] 1. Mexanizmi zədədən və tozdan qoruyan qurğu.

2. İçində mexanizm yerləşən metal qutu.

**KÁRTOÇKA** [*rus.*] 1. Üzərində bir şey yazmaq üçün düzbucaq şəklində kəsilmiş qalın kağız, ya karton vərəqəsi (kartoteka vahidi kimi). *Kataloq kartoçkası. Kartoteka beş min kartoçkadan ibarətdir.*

2. *dan.* Kiçik ölçüdə fotoşəkil. *Foto kartoçkası.* – [Zabit:] *Yenə şübhən qalmışsa, al bax,* [Arazın] *jandarm idarəsində çəkilmiş əksi, – deyə kartoçkanı ona verdi.* A.Şaiq.

3. Bilet və ya vərəqə şəklində vəsiqə. *Üzvlük kartoçkası. Müxbir kartoçkası. – ..O biri günü, günorta zamanı mənzilə qayıdıb, masamın üstündə bir vizit kartoçkası tapdım: "Cəlil Məmmədquluzadə – "Molla Nəsrəddin" məcmuəsinin redaktoru".* Ə.Haqverdiyev.

4. *köhn.* Norma üzrə ərzaq və s. almaq üçün kəsilmə talonu olan blank. *Çörək kartoçkası. Ərzaq kartoçkası. Kartoçka bürosu.*

**KARTOF** *is.* [*alm.*] 1. Yumrusu torpağın altında yetişən, nişasta ilə zəngin bitki.

2. Həmin bitkinin qida kimi işlədilən yumrusu. – *Evin xanımı tez o tərəfə keçib balaca boşqaba bir-iki parça qızardılmış kartof qoydu.* M.Hüseyn. *Arvad soyduğu kartofu bir yana qoyub, təəccüblə Qəribova yaxınlaşdı.* S.Rəhman. ☐ **Kartof unu** – kartofdan hazırlanan nişasta.

**KARTOFÇIXARAN** *is. k.t.* Kartofu yerdən çıxarmaq üçün maşın. // Sif. mənasında. *Kartofçıxaran aqreqat.*

**KARTOFÇU** *is.* Kartof əkib-becərməklə məşğul olan adam.

**KARTOFÇULUQ** *is.* Kartof əkib-becərməklə məşğul olma.

**KARTOFDOĞRAYAN** *is.* Kartof doğrayan maşın və s. // Sif. mənasında. *Kartofdoğrayan bıçaq.*

**KARTOFƏKƏN** *is. k.t.* 1. Kartof əkmək üçün işlədilən maşın və s. // Sif. mənasında. *Kartofəkən aqreqat.*

2. Kartof yetişdirməklə məşğul olan. *Kartofəkən rayonlar.*

**KARTOFKİMİLƏR** *cəm bot.* Kartof və ona bənzər bitkilərin daxil olduğu fəsilə.

**KARTOFSOYAN** *is.* Kartofun qabığını soymaq üçün xüsusi alət (bıçaq). // Sif. mənasında. *Kartofsoyan bıçaq.*

**KARTOFTƏMİZLƏYƏN** b a x **kartofsoyan.**

**KARTOFYIĞAN** b a x **kartofçıxaran.** *Kartofyığan kombayn.*

**KARTOQRAF** [*alm.* karte və *yun.* grapho] Coğrafiya xəritələri çəkən mütəxəssis; xəritəçi.

**KARTOQRAFİ́K** *sif.* 1. Kartoqrafiyaya aid. *Kartoqrafik işarələr.*

2. Coğrafiya xəritələrinin hazırlanması ilə əlaqədar olan. *Kartoqrafik işlər. Kartoqrafik material.*

**KARTOQRÁFİYA** [*alm.* karte və *yun.* grapho-dan] Coğrafiya xəritələri düzəltmək üsulundan bəhs edən elm, habelə bu xəritələrin tərtibi.

**KARTOQRÁM** [*alm.* karte və *yun.* gramma] *xüs.* Müəyyən hadisəyə aid statistik məlumatı kağız üzərində qrafik şəkildə, əyani surətdə göstərən xəritə. *Kartoqram düzəltmək.*

**KARTÓN** [*fr.* əsli *ital.*] Xüsusi qaydada hazırlanmış qalın bərk kağız. // Kartondan düzəldilmiş. *Karton qutu.*

**KARTONÇU** *is.* Karton və ya kartonaj hazırlamaqla məşğul olan fəhlə.

**KARTONAJ** [*fr.*] Kartondan qayrılan xırda şeylər. *Kartonaj emalatxanası.*

**KARTONAJÇI** *is.* Kartondan müxtəlif şeylər qayıran usta.

**KARTOTEKA** [*alm.* karte və *yun.* theke] 1. *is.* Müəyyən sistem üzrə yığılmış məlumat ya uçot mahiyyətli kartoçkalar toplusu. *Kartoteka şkafı. Kitabxana kartotekası. Lüğət kartotekası.*

2. *top.* Bu kartoçkaları saxlamaq üçün qutular.

**KARTOTEKAÇI** *is.* Kartotekaya baxan, kartoteka işləri ilə məşğul olan işçi.

**KARTOŞKA** [*rus.*] *dan.* b a x **kartof.** *Hədiyyə qızarmış kartoşka gətirib, uşağın qabağına qoydu.* Mir Cəlal.

**KARTVELLƏR** *cəm* Gürcülərin və onlara yaxın olan Qafqaz xalqlarının (lazların, minqrellərin və svanların) ümumi adı.

**KARUSEL** [*ital.*] Üstündə oturub əylənmək üçün at, araba, qayıq və s. şəklində minik yerləri olan, hərlənən qurğu; fırlanqıc. *Fırlanır karusel bir təkər kimi; Daima fırlanan, dönən yer kimi.* B.Vahabzadə.

**KARVAN** *is.* [*fars.*] 1. Bir-birinin ardınca sıra ilə hərəkət edən yüklü heyvan (əsasən dəvə) dəstəsi (qatarı); qafilə. *İt hürər, karvan keçər.* (Ata. sözü). *Mağıl keçən vaxtlar dəvə karvanları düzülürdü yola, ticarət malını yükləyirdik dəvələrə..* C.Məmmədquluzadə. *Bizim karvanımız beş çarvadar atından ibarət idi.* S.Hüseyn. ☐ **Karvan bağlamaq** – sıraya düzülmək, dəstə düzəltmək. *Yenicə işə qoşulmuş bal arıları çiçək üçün yaxındakı meşəyə karvan bağlamışdılar.* Ə.Vəliyev. **Karvan çapmaq (vurmaq, soymaq, dağıtmaq, kəsmək)** *köhn.* – yoldan gəlib keçən yüklü karvanları soymaq, soyğunçuluq etmək. *Kəsdim yollar, vurdum karvan; Çəkib soydum çox bazirgan.* “Koroğlu”. [Heydər bəy:] *Hər həftədə, hər ayda bir karvan çapmaq olurdu.* M.F.Axundzadə. [Məmmədağa:] *Ömər nəhayətdə ağıllı və kamallı oğlandır, amma bunun ilə belə atasının xoşuna gəlmir, zira ki, adam öldürməyir, quldurluq etməyir, karvan kəsmir.* N.Nərimanov. **Karvan çəkmək** – karvanı idarə etmək, karvana başçılıq etmək. *Darğa ləleş .. bu çətin yoldan şəhərə karvan çəkərdi.* S.Rəhimov. **Karvan yolu** *köhn.* – keçmişdə karvanların işlədiyi yol. *Sinəsi gül rəngli tala doludur; Bu çöllər ən qədim karvan yoludur.* S.Vurğun.

2. *məc.* Toplu halında bir-birinin ardınca, sıra ilə hərəkət edən şeylər haqqında. *Təyyarə karvanı. Maşın karvanı. Gəmi karvanı. – Dolanır göyləri bulud karvanı; Bürüyür düzləri Kürün dumanı.* H.K.Sanılı. *Fəza yollarında baş alıb gedən ulduzlar karvanı ağır-ağır yüksəlir, getdikcə böyük bir boşluqda qərq olaraq, tamamilə gözdən itirdi.* Ə.Məmmədxanlı.

3. *məc. klas.* Gəlib keçən şey haqqında (“bu dünyadan köçmə” mənasında). *Bahar*

*yetməkdədir, Qövsi, gözün aç, qönçə tək uyma; Yetişər köçməyə növbət sənə həm, karivandır bu.* Qövsi.

**karvan-karvan** *sif.* Karvan kimi, qatar-qatar, dəstə-dəstə. *Karvan-karvan göydən ulduzlar keçir; Öz bəxtinə hər kəs bir ülkər seçir.* S.Vurğun. *Süzülür göy üzündə buludlar karvan-karvan.* M.Seyidzadə.

**KARVANBAŞI** *is. köhn.* Karvana başçılıq edən adam; karvançı. *Karvanbaşı üstündə mürgülədiyi birinci dəvənin üstündən sıçrayaraq tələsik onu cilovundan tutub yola çəkir və maşının yanından keçirirdi.* M.İbrahimov. *Karvanbaşı, qocalmışam, karvanını aramla çək; Çəkirəm dünya dərdini, çiynimdən qurğuşun gedir.* Şəhriyar.

**KARVANBAŞILIQ** *is. köhn.* Karvana başçılıq etmə, karvanbaşının işi və vəzifəsi.

**KARVANÇI** *is. köhn.* 1. Karvanla yük daşıyan adam.

2. Karvan başçısı, karvanı idarə edən şəxs; karvanbaşı. *İbn Mingə qulaqlarına inanmadı, karvanbaşı olduğu bir karvanda karvançı bir oğlanın üzəngisini tutmaq onun üçün çox ağır və dözülməz bir cəza idi..* Ə.Məmmədxanlı.

**KARVANÇILIQ** *is. köhn.* 1. Karvanla yük daşıma peşəsi.

2. Karvana başçılıq etmə; karvanbaşılıq.

**KARVANQIRAN** *is.* 1. Zöhrə (ulduz). *Öksüz taleyim tək gecikdin nədən? Karvanqıran doğdu, görünmədin sən.* C.Cabbarlı. *Buludun pərdəsi sıyrıldı bir az; Göydə Karvanqıran gümüşü qotaz.* R.Rza.

2. *məh.* Dağdan əsən soyuq külək, dağ küləyi.

**KARVANQOVAN** *sif.* Çox şiddətli külək, qasırğa haqqında. *İncə ətir yayırdı bağçadakı çiçəklər; Uzaqdı bu həyətdən karvanqovan küləklər.* S.Rüstəm.

**KARVANSARA** *is.* [*fars.*] 1. Özgə yerlərdən gələn karvanların və yolçuların müvəqqəti qalması, qoşqu heyvanları və minik vəsaitinin saxlanması üçün böyük həyəti olan xüsusi bina. [Qərib] *küçələrdə gəzə-gəzə bir adam axtarırdı ki, karvansaranı soruşsun, bir də gəlib bir meydana çıxdı.* "Koroğlu". [Yusif şah] *əmr elədi ki, hər yerdə yollar təmir olunsun və lazım məqamlarda və mənzillərdə körpülər və karvansaralar tikilsin.* M.F.Axundzadə.

2. *məc. zar.* Qonağı, gəlib-gedəni çox olan yer haqqında. *Ev dönüb karvansaraya.*

3. *mən.* Böyük, geniş yer mənasında. *Araba karvansara kimi böyük bir həyətə girdi.* A.Şaiq.

4. *məc. dan.* Yoxsul, kasıb, içində müxəlləfatı, dir-dirriyi olmayan mənzil haqqında. *Evi karvansaraya oxşayır.*

**KARVANSARAÇI** *is. köhn.* Karvansara sahibi, karvansara saxlayan adam. *Bu şəhərin Yuxarıbaş deyilən məhəlləsində Kərbəlayı Kazım adlı bir karvansaraçı var idi.* P.Makulu. *Bu saat karvansaraçıya deyim, onları oyatsın. Nə qədər yükünüz var çatın!* Q.İlkin.

**KARVANSARAÇILIQ** *is. köhn.* Karvansaraçının peşəsi, karvansara saxlama. *Karvansaraçılıq etmək.*

**KARVANVURAN** *is. köhn.* Yoldan gəlib keçən karvanları soyan; yolkəsən, quldur, çapovulçu.

**KARVANYOLU** *is.* b a x **kəhkəşan.**

**KARYER** *is.* [*fr.*] Karxana. *Daş karyerası. Qum karyerası.*

**KARYÉRA** [*fr.* carriere] Xidməti və ya başqa fəaliyyət sahəsində irəliləmə, şöhrətlənmə, tanınma; mənsəb, şöhrət. [Sultan:] *Bizim bir para cavanlarımızın evini yıxan, bax, elə bu karyera həvəsidir.* İ.Hüseynov.

**KARYERİST** [*fr.* carriere-dən] Karyerasını hər şeydən üstün tutan adam; mənsəbpərəst, şöhrətpərəst. *Ona baxar, nəğmə deyər qızların gül dodağı; Karyeristin açılmayır tutqun qaşı, qabağı.* S.Vurğun.

**KARYERİZM** [*fr.*] Mənsəbpərəstlik, şöhrətpərəstlik.

**KASA** *is.* [*fars.*] 1. Çini, büllur, saxsı və ya metaldan qayrılmış ağzıgen qab. *Mis kasa. Çini kasa. Kasaya xörək tökmək. Bir kasa su. – Axşam çay ortalığa gələndə gənə bir kasada qaynar süd ortalığa gəldi.* C.Məmmədquluzadə. *Kənd uşaqları əllərində badya, mis kasa dərəyə enirdilər.* A.Şaiq.

2. Baş sümüklərinin, beyni əhatə edən yuxarı hissəsi. *Beyin kasası.*

3. Qaşıq və ona bənzər şeylərin çuxuru. *Qaşıq kasası. Çömçə kasası. Tarın kasası.*

4. *bot.* b a x **kasacıq** 2-ci mənada. *Kasasını açır zanbaq; Xoş bir ətir saçır zanbaq.* M.Dilbazi.

◊ **Kasa rəqsi** – içi su ilə dolu kasalarla ifa edilən xalq rəqsi. [Şahin:] *Mənim orijinal bir nömrəm var. O da kasa rəqsidir; kasaları su ilə doldurub bir podnosa düzürəm və başıma qoyub rəqs eləyirəm.* S.Rəhman. **...kasası daşmaq (dolmaq)** – bir şeyin son həddini göstərir. *Əvvəl bu fələk cümlədən əymişdi damağı; Qəm kasəsi daşdı.* M.Ə.Sabir. [Gövhər xanım:] *Daha bəsdir! Səbir kasam dolub daşmış.* S.S.Axundov.

**KASACIQ** *is.* 1. Kiçik kasa, balaca kasa.

2. *bot.* Açma dövründə çiçəyin xarici örtüsü; kasa. *Tam çiçəkdə kasacıq, taccıq, erkəkcik və dişicik olmalıdır.* M.Qasımov.

**KASAD** [*ər.*] 1. *sif.* Ticarətdə: mala tələb olmadığı, müştəri tapılmadığı, onun satılmadığı hal; alış-verişdə durğunluq, rəvacsızlıq. [Hacı Qara:] *Bu kasad bazarda mənim bir şahı qazancım yoxdur, abbasını hardan alıram, sənə verim?* M.F.Axundzadə. ☐ **Kasad etmək (eləmək)** – alıcıdan, müştəridən məhrum etmək; satılmamasına, alınmamasına, yayılmamasına səbəb olmaq. **Kasad olmaq** – b a x **kasadlaşmaq.**

2. *is.* Qıt(lıq), qəhət(lik), azlıq, çatışmazlıq.

**KASADLANMA** "Kasadlanmaq"dan *f.is.*

**KASADLANMAQ** b a x **kasadlaşmaq.**

**KASADLAŞDIRMA** "Kasadlaşdırmaq"-dan *f.is.*

**KASADLAŞDIRMAQ** *f.* Kasad etmək, azaltmaq, qıtlıq törətmək, yoxa çıxartmaq.

**KASADLAŞMA** "Kasadlaşmaq"dan *f.is.*

**KASADLAŞMAQ** *f.* 1. Kasad olmaq; müştərisi, alıcısı olmamaq; malları satılmayıb qalmaq, alış-verişdə durğunluq əmələ gəlmək (çox vaxt "bazar(ı)" sözü ilə). *Bazar gəldikcə kasadlaşır, camaat dindən-məzhəbdən çıxır, üləmaya etina eləmir.* Ə.Haqverdiyev. *Kərbəlayının bazarı hər gün kasadlaşırdı.* M.Hüseyn.

2. Qıtlaşmaq, qəhətləşmək, yoxa çıxmaq.

**KASADLIQ** *is.* 1. Ticarətdə malın satılmadığı, işə getmədiyi, müştərisi olmadığı vəziyyət; rəvacsızlıq, alış-verişdə durğunluq, böhran. *Tərəkəmə şəhərdən çəkilib getmişdi, bazar bərk kasadlıq idi.* Çəmənzəminli. [Həsən:] *Bazarın kasadlığı ovqatımı təlx edib.* Ə.Haqverdiyev. [Qafar:] *Bu kasadlıq vaxtında mən səni üç ziyarətə necə aparım?* S.S.Axundov.

2. Qıtlıq, qəhətlik. *Başlanır illərin kasadlıq ili; Muğanın başına dünya dar olur.* S.Vurğun. ☐ **Kasadlıq çəkmək** – qıtlıq, qəhətlik keçirmək.

3. Kasıblıq, yoxsulluq, ehtiyac mənasında. *Ağardı saçların, ömrün də yarı; Kasadlıq keçirir şerin bazarı.* S.Vurğun. ☐ **Kasadlığa düşmək** – kasadlıq çəkmək, yoxsul olmaq.

**KASAMAS** *is.* [*fars.*] Qatıq.

**KASÁSİYA** *is.* [*lat.*] *hüq.* Qanuni qüvvəyə minməmiş məhkəmə qərar və hökmlərindən şikayət. // Yuxarı məhkəmə orqanları tərəfindən bu şikayətə baxılması.

**KASAŞƏKİLLİ** b a x **kasavari.**

**KASAŞƏKİLLİLİK** b a x **kasavarilik.**

**KASAVARİ** *sif.* Kasa şəklində, kasaya oxşayan; kasaşəkilli.

**KASAVARİLİK** *is.* Kasa şəklində olan şeyin halı; kasaşəkillilik.

**KASET** *is. fr.* Fotoplyonka, maqnitofon, video yazıları üçün qoruyucu qutular.

**KASIB** *sif.* [*ər.*] 1. Heç bir var-dövləti olmayan, ehtiyac içində yaşayan adam, yoxsul (*varlı, dövlətli* əksi). *Kasıb adam. – Kasıbdı, bayquşdu, yoxdu bir zadı; Heyif zəhmətinə, haqqı-sayına.* Aşıq Ələsgər. *Müsəlmanlar kasıbdırlar, qeyri millətlərdən çox kasıbdırlar və bunun da səbəbi odur ki, müsəlmanların xərci çoxdur.* C.Məmmədquluzadə. *Bilirəm kasıb oğlanlarsınız, mənim əlimdəki qızlara evlənib onların nazını çəkə bilməzsiniz.* M.S.Ordubadi. // İs. mənasında. *Kasıbı dəvə üstündə böv vurar.* (Məsəl). *Varlı, kasıb bu dünyadan köçərlər; Yaxşını, yamanı görüb seçərlər.* "Koroğlu" ☐ **Kasıb düşmək** – yoxsullaşmaq, kasıblaşmaq. [Məşədi Səttar] *axır kasıb düşüb evini satdı.* Ə.Haqverdiyev. [Dilara Bəhruza:] *İndi birdən-birə kasıb düşmüş Dilaraya əfsanələr dünyası vəd edirsən!* Ə.Məmmədxanlı.

2. Yoxsul, kasıbyana, kasıbvari; yoxsulvari. *Bir azdan sonra kasıb bir süfrə açıldı.* A.Şaiq. [Vidadi:] *Kasıb komacığım özümə*

*yetər; Burda yazılmışdır yüzlərlə əsər.* S.Vurğun.

3. *məc.* Zəif, naqis, qüsurlu. *Ağıldan kasıb. Bilikdən bir az kasıbdır. – Bəlkə bu dil çox kasıbdır; Qucağına sığışmayır; Əsrin böyük fikirləri?..* B.Vahabzadə.

1. B a x **kasıbvari, kasıbyana.** [Alı kişinin] *kasıbca süfrəsi həmişə dostların qabağında açıq olardı.* "Koroğlu".

2. *sif. məc.* Kiçik, balaca, az. *Canı var süddən bayaz; Kasıbca boydan bir az.* Ə.Cavad.

**KASIBÇILIQ** *dan.* b a x **kasıblıq.** [Kərbəlayı Abdulla] *..bir balaca dükanın qabağında piti düzüb kasıbçılıq edir.* C.Məmmədquluzadə. *Kasıbçılıq* [Tükəzban] *üçün çətin bir iş deyil idi.* B.Talıblı.

**KASIBFƏNDİ** *sif.* Kasıba yarayan, kasıba əl verən, kasıb üçün münasib olan. [Hüseynəli xan:] *Mənim qızım .. oxumuş qızdır, sənə yaramaz. Sən bir çölçü babasan, sənə bir kasıbfəndi qız gərək.* N.Vəzirov.

**KASIBKAR** b a x **kəsbkar.** [Fatmanın əri:] *Mən kişini tanıyıram, öz işində kasıbkar bir adamdır. Amma oğlu bir az dələduzdur.* Çəmənzəminli.

**KASIBKARLIQ** b a x **kəsbkarlıq.** [Kazım:] *Bu saat başını salamat saxlamaq istəyirsənsə, başını aşağı sal, kasıbkarlığına qurşan, bu tifilləri saxla.* Çəmənzəminli.

**KASIB-KUSUB** *top. dan.* Kasıb, yoxsul adamlar, füqəra. *Tiflisin bütün lampaları yandı, kasıb-kusub evinə çəkildi.* "Aşıq Qərib". [Bədəl:] *Amma kasıb-kusubla gərək heç kəsin işi olmasın.* Ə.Haqverdiyev. [Sara bibi:] *Onsuz da kasıb-kusub arvadı kənd yerində çadra örtmür.* Qantəmir.

**KASIBLAMA** "Kasıblamaq"dan *f.is.*

**KASIBLAMAQ** *f.* Kasıblığa düşmək; dövləti, varı əlindən çıxmaq; yoxsullaşmaq.

**KASIBLAŞDIRILMA** "Kasıblaşdırılmaq"-dan *f.is.*

**KASIBLAŞDIRILMAQ** *məch.* Kasıb hala salınmaq; yoxsullaşdırılmaq.

**KASIBLAŞDIRMA** "Kasıblaşdırmaq"dan *f.is.*

**KASIBLAŞDIRMAQ** *f.* Kasıblaşmasına səbəb olmaq; yoxsullaşdırmaq.

**KASIBLAŞMA** "Kasıblaşmaq"dan *f.is.*

**KASIBLAŞMAQ** *f.* Var-yoxu əlindən çıxıb, kasıb hala düşmək, ehtiyaca düşmək; yoxsullaşmaq.

**KASIBLIQ** *is.* 1. Kasıbın hal və vəziyyəti; yoxsulluq. *Kasıblıq eyib deyil, oğurluq eyibdir.* (Ata. sözü). *Kasıblığın evi yıxılsın! İndiyə kimi* [Məhəmmədhəsən əminin] *qolunu, qıçını bağlayıb, qoymur bir yana tərpənsin.* C.Məmmədquluzadə. ◻ **Kasıblıq etmək, kasıblıqla məşğul olmaq** – yaşamaq üçün minimum qazanc, gəlir verən bir peşə (iş) ilə məşğul olmaq. *Bizim məscidin dalında, qapının səkisində əlli-əlli beş yaşında bir kişi oturub kasıblıq edir.* C.Məmmədquluzadə. [Bədəl:] *Qardaşlar, az keçər ki, hamımız genə evlərimizə qayıdıb kasıblığımızla məşğul olarıq.* Ə.Haqverdiyev. ◻ **Kasıblığa düşmək** – əvvəlki varından məhrum olmaq, əli aşağı düşmək.

2. Yaşamaq üçün minimum qazanc verən bir peşə, sənət və ya iş. [Namaz:] *Mənə izin ver, gedim, özüm üçün bir kasıblıq tapım.* Ə.Haqverdiyev. [Muzdur] *Allah-talaya şükür edib, təzədən kasıblığa qədəm qoydu.* S.Qənizadə. [Yaşlı kişi:] *Neçin qardaşını işindən, kasıblığından avara salırsan?* S.Hüseyn.

**KASIBVARİ, KASIBYANA** *zərf* Kasıba layiq, kasıba müvafiq, kasıbın gücü, imkanı çatdığı qaydada; kasıbca. *Kasıbyana* (s.) *süfrə. Kasıbyana yaşayır.*

**KASKA** [*fr.* casque, əsli *isp.*] Əsasən metaldan olan baş geyimi; dəbilqə, taskülah. *Zabitin kaskası on addım kənara dığırlandı.* Mir Cəlal.

**KASKADYOR** *is.* [*fr.*] Kino çəkilişlərində artistin mürəkkəb hərəkətlərini yerinə yetirən əvəzedici.

**KASNİ** *is.* [*fars.*] *bot.* Xalq təbabətində işlədilən incə yarpaqlı, mavi çiçəkli bitki. ◻ **Kasni arağı** – bu bitkinin çiçəklərindən çəkilmiş, xalq təbabətində işlənən cövhər.

**KASSA** [*ital.*] 1. Pul, qiymətli kağızlar və s. saxlamaq üçün yeşik, şkaf, sandıq. *Dəmir kassa. Kassanı açmaq. Kassanı bağlamaq.*

2. İdarələrdə, müəssisələrdə pul qəbul etmək, saxlamaq, vermək, bilet satmaq və s. üçün xüsusi şöbə. *Dəmir yol kassası. Teatr kassası. Kassadan pul almaq. – Hələ kassa açılmamışdır.* S.Hüseyn. *Hamı müsafirlər*

*kassa qabağına toplandılar.* T.Ş.Simurq. *Kassanın qabağı bomboş idi.* S.Rəhman.

3. Müxtəlif kredit idarələrinin adı. *Əmanət kassası. – Əmanət kassası deyil uşaqlar; Xərcindən kəsərək qazanc görəsən.* B.Vahabzadə.

4. İdarə və ya müəssisənin nağd pulu. *Kassanı yoxlamaq. Kassanı təhvil vermək. Kassa dəftəri.*

5. *köhn.* Mətbəədə yuvacıqlara (gözlərə) bölünmüş şrift (hürufat) qutusu. [Mürəttib] *sürətlə kassanın yuvacıqlarından xırda şriftləri yan-yana düzür.* S.Rəhman.

◊ *köhn.* **Qarşılıqlı yardım kassası** – üzvlük haqqı şəklində toplanılan vəsaitdən maddi yardım göstərmək üçün işçilərin könüllü təşkilatı.

**KASSİR** [*ital.*] Pul, qiymətli kağızlar qəbul edən və verən, habelə bilet satan işçi, kassa müdiri. *Kassirə pulu verib, iki bilet aldım. Kassir vəzifəsində çalışmaq. – Hacının halı fövrən dəyişdi. Kassiri qeyzli çağırıb buyurdu ki, "komandirə" on manat versin.* Ə.Haqverdiyev.

**KASSİRLİK** *is.* Kassirin işi, vəzifəsi. *Kassirlik etmək* (kassir vəzifəsində çalışmaq).

**KÁSTA** [port. casta] Hindistanda və Şərqin bəzi başqa ölkələrində: əsli-nəsəbi, ata-baba peşələri və hüquqi vəziyyətləri cəhətindən bir-biri ilə bağlı olan qapalı ictimai qrup, təbəqə, silk. // *məc.* Qapalı ictimai qrup, dəstə.

**KASTAÇILIQ** *is.* Kasta qapalılığı, silki və ya peşəkarlıq cəhətdən qapalılıq.

**KASTANYET** [*isp.*] Barmaqlara taxılaraq rəqs zamanı musiqi vəzninə uyğun surətdə şıqqıldadılan şaxşax.

**KASTÉT** [*fr.* casse-tete – başını əz] b a x **beşbarmaq** 1-ci mənada.

**KAŞ** *əd.* [*fars.*] Bəzən "ki" bağlayıcısı ilə birlikdə işlənib, fövqəladə arzu, həsrət, yaxud təəssüf və peşmançılıq bildirir. *Kaş tez gələydi. Kaş elə deməyəydim. Kaş ki, gəlməyəydim. – Parə-parə könlümün suzidərunə tabı yox; Göz yolunda qətrə-qətrə qan olub çıxsaydı kaş!* Füzuli. [Mirzə Fətəli:] *Kaş hamı belə olaydı.* Ə.Haqverdiyev.

**KAŞALÓT** [*fr.* cachalot, əsli *port.*] *zool.* Kitlər qrupundan məməli iri dəniz heyvanı.

**KAŞANƏ** *is.* [*fars.*] Qəsr, saray, imarət. *Hələlik tullamışıq xaneyi-viranələri; Dolanıb kişvəri-Tiflisdə kaşanələri.* M.Ə.Sabir. *O demişdir: – Mənim komam; Möhtəşəmdir min saraydam; Kaşanələr, xanimanlar; Edə bilməz onu əvəz.* B.Vahabzadə.

**KAŞI** *is.* [İranda Kaşan şəhərinin adından] 1. Üzərinə parlaq şirdən naxış çəkilmiş gil çini qab. *Burda bir naşı ağlar; Əlində kaşı ağlar; O evdən cavan gedə; Divarı, daşı ağlar.* (Bayatı). *Dedim bu dünyada bir toy qurulsun; Mey dolu al kaşı yadıma düşdü.* M.Rahim.

2. Adətən, divarların xarici səthinə bəzək üçün vurulan üzü naxışlı çini. *Üzərinə kaşı çəkilmiş divar. – Bayırı kaşı, çini; İçərisi toyuq hini.* (Ata. sözü). *Şuşanın kaşıdan göy məscidləri; Yarış meydanları, cıdır düzləri; Ulu Pənah xanın ayaq izləri; Görən, bizim üçün darıxmırmı bəs?* B.Vahabzadə.

**KAŞILI** *sif.* Kaşı ilə örtülmüş, üzərinə kaşı vurulmuş. *Kaşılı soba. – Xurma ağacları kökündən qopub yıxılır, mərmər saraylar yerlə yeksan olur, mavi kaşılı minarələr uçulur, ağ şəlalə qaralıb qıvrılır, üfüqü zülmət pərdəsi bürüyür.* Ə.Məmmədxanlı.

**KAŞNÉ** [*fr.* cache-ner] Palto altından boyuna sarılan uzunsov parça.

**KATAKOMBA** *is.* [*ital.*] Süni və ya təbii mənşəli yeraltı labirintlər.

**KATALİTİK** *sif.* [yun.] *kim.* Katalizlə bağlı olan, kataliz təsirinə aid olan. *Katalitik proses.*

**KATÁLİZ** [*yun.* katalysis] *kim.* Katalizatorların təsiri ilə kimyəvi reaksiyanın törəməsi və ya sürətinin dəyişməsi.

**KATALİZÁTOR** [*yun.*] Kimyəvi reaksiyaları özü dəyişmədən sürətləndirən və ya yavaşıdan maddə.

**KATALÓQ** [*yun.*] Müəyyən qayda üzrə tərtib edilmiş şeylərin (kitabların, əlyazmalarının, muzey eksponatlarının və s.) siyahısı. *Kitabxana kataloqu. Sərgi kataloqu. Texniki ədəbiyyat kataloqu. Kataloq otağı. Kataloqa salmaq.* – [Nuriyyə:] *Balaca bir kataloq düzəltmək üçün kitabları yenidən siyahıya aldım.* İ.Əfəndiyev.

**KATALOQÇU** *is.* Kataloq tərtibçisi.

**KATAR** [*yun.*] *tib.* Hər hansı bir bədən üzvünün (məs.: boğazın, burnun, ciyərin, mədənin və s.) selikli qişasının iltihabı. *..Mədəsi katar olan şəxslər düşərgədə sağalır..* S.Vəliyev.

**KATARÁKT** [*yun.* katarraktes – şəlalə] *tib.* Göz büllurcuğunun görmə qabiliyyətinin zəifləşməsinə və korluğa səbəb olan donuqlaşması (xalq arasında buna "mirvari suyu" deyilir).

**KATARAKTLI** *sif. tib.* Kataraktası olan. *Kataraktlı göz.*

**KATBİN** *is. köhn.* Kənarları xəzli qadın paltarı. [Məşədi Xonku] *köhnə katbini sandıqdan çıxardıb, xəzlərini güvədən təmizləmişdi.* Çəmənzəminli.

**KATEQÓRİYA** [*yun.*] 1. *fəls.* Maddi aləmin, varlığın ən ümumi və mühüm xassə və münasibətlərini əks etdirən məfhum. *Səbəbiyyət kateqoriyası. Zəruriyyət kateqoriyası. Materiya fəlsəfi kateqoriyadır.*

2. Elmi terminologiyada: hadisələrin, əşyanın dərəcəsini, yaxud onların əlamətlərinin ən ümumi xüsusiyyətlərini göstərən məfhum. *Qrammatik kateqoriyalar.*

3. Dərəcə.

**KATEQORİYALI** *sif.* Bu və ya digər kateqoriyaya aid olan; kateqoriyası (dərəcəsi) olan. *Müxtəlif kateqoriyalı quyular. Kateqoriyalı idmançı.*

**KATER** [*ing.* katter] Yaxın məsafələrdə işləmək üçün motorlu və ya yelkənli kiçik gəmi. *Zirehli kater. Yedək kateri. Motorlu kater. Torpeda kateri* (torpedalarla silahlanmış kater). – *Katerə oturub Neft daşlarından uzaqlaşdıq.* M.İbrahimov. *Əgər fəhlələr sürətlə gedən katerə minsəydilər, Qara daşlarla liman arasındakı məsafəni beş saata qət edə bilərdilər.* M.Hüseyn. *Şırım salır sularda; Sürətlə gedən kater.* Ə.Cəmil.

**KATERÇİ** *is.* Katerdə xidmət edən matros.

**KÁTET** [*yun.* kathetos] *riyaz.* Düzbucaqlı üçbucaqda düz bucağı əmələ gətirən tərəflərdən biri.

**KATÉTER** [*yun.*] *tib.* Dərman yeritmək, yumaq və ya boşaltmaq üçün bədən boşluqlarına və ya kanallarına yeridilən boru; zond. *Kateter salmaq. Kateter qoymaq.*

**KATİB** *is.* [*ər.*] 1. İdarənin, müəssisənin, təşkilatın və ya bir şəxsin yazı-pozu işlərini aparan adam. *Dəftərxana katibi. Məhkəmə katibi. İdarə katibi. Yerli komitə katibi. – Katib fərmanı oxuyandan sonra qiymətli bir xələt gətirib vəliəhdin çiyninə saldılar.* M.S.Ordubadi.

2. İclasın, yığıncağın və s.-nin protokolunu yazan şəxs. *İclasın katibi.*

3. Hər hansı bir təşkilatın seçilmiş rəhbəri. *Katib dəstəyi qaldırıb, bir an qulaq asdıqdan sonra soyuqqanlıqla dedi: – Bəli, buraxın gəlsinlər.* Q.İlkin.

4. Hər hansı bir idarənin təşkilat və icra şöbəsinin başında duran şəxs. *Qəzet redaksiyası katibi. Jurnalın katibi.*

5. *köhn.* Yazan, yaxşı qələmi olan. *Əzəl katibləri üşşaq bəxtin qarə yazmışlar.* Füzuli. *Mən aşıq, yaza dərdim; Katib yox, yaza dərdim; Fəqir bülbüllər kimi; Qalıbdır yaza dərdim.* Sarı Aşıq.

◊ **Dövlət katibi** – ABŞ-da xarici işlər nazirinin adı. **Elmi katib** – elmi idarənin cari işlərinin təşkilinə cavabdeh olan şəxs. *İnstitutun elmi katibi.*

**KATİBƏ** *is.* [*ər.*] Qadın (qız) katib. *Qüdrətin qarabuğdayı katibəsi sürətlə şığıyıb içəri girdi.* M.Hüseyn. *Narınc çox kobud bir şəkildə katibəyə cavab verdi..* S.Rəhman.

**KATİBLİK** *is.* 1. Katib vəzifəsini aparma. *İlk təşkilat işlərini aparmaq üçün Abdulla Şaiq, Salman Mümtaz və məndən ibarət olan üçlük təşkil edilmişdi. Katiblik mənim öhdəmə buraxılmışdı.* A.Səhhət.

2. Hər hansı bir təşkilatın, idarənin təşkilat və icra mahiyyətində olan, cari işlərini aparan şöbəsi. *Birləşmiş Millətlər Təşkilatının katibliyi.* // *top.* Bu cür şöbənin işçilər heyəti.

3. *top.* Protokol işlərini aparmaq, qərarlar hazırlamaq və s. üçün yığıncaqda, konfransda və s.-də seçilən şəxslərdən ibarət heyət. *Nümayəndələr konfransın rəyasət heyəti və katibliyini seçdilər.* – [Rza Qəhrəmani Firidunə:] *Buyur, əzizi-mən, gör gələcəkdə yeni dövlətin vəziri olsan, məni katibliyə götürərsənmi? – deyə zarafat etdi.* M.İbrahimov.

**KATOD** [*yun.* kathodos] *fiz.* Mənfi yüklü elektrod (*anod* əksi). □ **Katod lampası** –

elektromaqnit titrəyişləri əmələ gətirmək, yaxud onları gücləndirmək üçün cihaz.

**KATODLU** *sif.* Katodu olan. *Katodlu lampa.*

**KATÓLİK** [*lat.* əsli *yun.*] Katoliklərə, katolisizmə aid olan, mənsub olan. *Katolik keşişi. Katolik məzhəbi. – ..Katolik kilsəsində hətta ibadəti də musiqi səsi ilə əmələ gətirirlər.* C.Məmmədquluzadə.

**KATOLİKLİK** *is.* Katolik məzhəbinə mənsub olma, katolisizmə mənsubiyyət; katolisizm.

**KATOLİKÓS** [*yun.*] Kilsə başçısının (patriarxının) titulu.

**KATOLİSİZM** [*yun.*] Başında Roma papası duran qərbi xristian məzhəbi.

**KÁTORQA** *is.* [*yun.*] *tar.* 1. Son dərəcə sərt bir şəraitdə ağır icbari iş, sürgün və həbs şəklində verilən cəza, habelə sürgün edilmiş cinayətkarlar üçün icbari iş yeri. *Katorqaya məhkum edilmək. Katorqaya göndərilmək. Katorqadan qaçmaq. – ..Amma ağır tənbehlərin, yəni Sibirə və katorqaya düşənlərin müddətinin bir hissəsi qalır, bir hissəsi bağışlanır.* C.Məmmədquluzadə. *Katorqa cəzası – insanları diri-diri qəbrə gömmək üçün idi.* M.Hüseyn.

2. *məc.* Çox ağır həyat şəraiti və ya zəhmət haqqında.

**KATTA** *is. dan.* b a x **kətxuda.** *Kattanı gör, kəndi çap.* (Ata. sözü). *Müxtəsərin deyir Aşıq Ələsgər; Koxanın, kattanın zatı çıxmışdı.* Aşıq Ələsgər. *Bu* [şəxs] *Danabaş kəndinin kattası Xudayar bəydi.* C.Məmmədquluzadə.

◊ **Katta danışmaq** – yekə-yekə danışmaq.

**KATTALIQ** *dan.* b a x **kətxudalıq**. *İndi iki il olar ki, Xudayar bəy Danabaşda kattalıq eləyir.* C.Məmmədquluzadə.

**KATYUŞA** [*rus.* xüs. addan] *dan.* 1941-1945-ci illər Böyük Vətən müharibəsi zamanı avtomobildə qurulmuş reaktiv minaatan silahın zarafatyana adı. *Mən od-alov yağdırdım katyuşatək dilimdən.* S.Rüstəm.

**KAUÇÚK** [*ing.* əsli *isp.*] Bəzi tropik bitkilərin şirəsindən, yaxud zavod üsulu ilə süni alınan elastik maddə (bu maddədən rezin istehsal edilir). *Təbii kauçuk. Sintetik kauçuk. Kauçuk zavodu.* // Kauçukdan qayrılmış. *Kauçuk boru.*

**KAUÇUKLU** *sif.* Tərkibində kauçuk olan. *Kauçuklu bitkilər.*

**KAUSTİK** *sif.* [yunancadan] *kim.* Yeyici, yandırıcı. *Kaustik maddələr.* □ **Kaustik soda** – sabun istehsalında, toxuculuq işlərində tətbiq edilən kimyəvi maddə.

**KAVALÉR**[1] [*fr.* cavalier] *köhn.* Qadınla birlikdə rəqs edən, yaxud cəmiyyətdə, qonaqlıq və s.-də onu məşğul edən, əyləndirən kişi. *..Kavalerlər cürətlənib xanımların yanında yer tutdular.* Puşkindən. // *köhn.* Pərəstişkar.

**KAVALÉR**[2] [*lat.*] Hər hansı bir ordenlə təltif olunmuş adam. *Kutuzov ordeni kavaleri.*

**KAVALERLİK** *is.* Kavaler olma (b a x **kavaler**). *Kavalerlik etmək.* – [Əsgər bəy:] *Bəli, sənin kavalerliyinə söz yoxdur.* Ə.Haqverdiyev.

**KAVATİNA** [*ital.*] *mus.* Operada: kiçik lirik ariya. *Məhz operaya xas olan ayrı-ayrı formalara daha çox müraciət edilir: məsələn, ariya, ariozo, kavatina.* Ə.Bədəlbəyli.

**KAVÉRNA** [*lat.*] *tib.* Xəstəlik üzündən canlı orqanizm toxumalarının dağılması nəticəsində bədən üzvlərində (məs.: vərəm xəstəliyində ciyərdə) əmələ gələn boşluq.

**KAVERNALI** *sif. tib.* Kavernası olan (b a x **kaverna**). *Kavernalı ciyər.*

**KAYUT(A)** [*holl.*] Gəmilərdə sərnişinlər və ya komanda heyətinə mənsub şəxslər üçün ayrıca otaq. [Ağaverdi qəzeti] *eləcə kayutunda buraxıb vaxta gedir.* S.Hüseyn. *Kəyan buradan uzaqlaşıb, öz bölüyünün yerləşdiyi kayuta yönəldi.* Ə.Əbülhəsən.

**KAZAK** 1. *tar.* XV-XVII əsrlərdə Rusiyada: feodal və mülkədarların zülmündən ucqarlara (Don, Yaik, Zaporojye) qaçıb azad olmuş təhkimli kəndlilərə, nökərlərə və şəhər yoxsullarına mənsub adam. *XVI əsrdə rus dövlətinin hüdudunda, Donətrafı düzənlərdə çoxlu azad kazaklar yaşayırdı. Bunlar, əsasən, feodalların zülmündən qaçmış kəndlilər və nökərlər idi.*

2. İnqilabdan qabaq Rusiyada: XVIII əsrdən başlayaraq imtiyazlı şərtlərlə torpaqdan istifadə müqabilində xüsusi qoşun hissələ-

rində xidmət etməli olan Don, Kuban, Terek, Orenburq və b. vilayətlərdə doğulmuş adam; hərbi silk nümayəndəsi. // Həmin vilayətlərin əhalisindən düzəlmiş hərbi hissələrdə (adətən süvari qoşunlarda) öz atları və əsləhəsi ilə xidmət edən əsgər. *Kazak süvariləri. – İrəvanda Cəfərabad məhəlləsində oturan kazak qoşunları iyunun ikisində Kənargir dağına, yaylağa gedəsi idilər.* C.Məmmədquluzadə. // İnqilabdan əvvəl Rusiyada: inqilabi hərəkatı boğmaq, fəhlə tətillərini yatırmaq üçün istifadə edilən xüsusi süvari qoşunların əsgəri. *Yanlarında çapar, kazak, yüzbaşı; Daşınır Hacının əmliyi, aşı.* H.K.Sanılı. *Keçmişdə kəndə pristav gələndə atlı kazaklar pristav düşən evin yüz metrliyinə adamları buraxmazdılar.* Ə.Sadıq.

3. Keçmiş hərbi vilayətlərdə doğulmuş şəxs, kəndli. *Don kazakları. Terek kazakları.*

**KAZAKXANA** *is. köhn.* Kazakların yaşadığı qışla, kazarma. *Kazak zabitləri tək-tək, cüt-cüt kazakxanaya gəlməyə başladılar.* P.Makulu.

**KAZAKLIQ** *is. tar.* Kazakın işi, məşğuliyyəti (b a x **kazak** 2-ci mənada).

**KAZARMA** [*fr.* əsli *ital.*] Hərbi hissələri yerləşdirmək üçün xüsusi bina; qışla. *Əsgər kazarması. // köhn.* Fabrik və ya zavod yanında fəhlələr üçün ümumi yataqxana. *Fəhlə kazarmaları çox çirklidir, darısqaldır. Bir kiçik kazarmada altmış fəhlə yerləşmişdir.* M.S.Ordubadi. *Fəhlələrdən bir neçə nəfəri Qurbanın qanlı cənazəsini kazarmaya gətirirlər.* M.İbrahimov. // *dan.* Şablon üzrə tikilmiş yaraşıqsız, görkəmsiz ev, bina haqqında. *Bu ev lap kazarmaya oxşayır. Bu bina lap kazarmadır.*

**KÁZEİN** [*lat.*] *kim.* Süd çürüdükdə onun tərkibində əmələ gələn mürəkkəb zülali maddə (kəsmik və pendirlərin əsas tərkib hissəsi). // Noxudun, soyanın tərkibində olan zülal maddəsi. ☐ **Kazein boyası** – tərkibində kazein olan müxtəlif rəngli boya. *Kazein boyaları binanın iç və bayır tərəflərini rəngləmək üçün işlədilir.* A.Quliyev.

**KAZİNO** [*ital.*] Şəhər kənarında və kurortlarda restoranları, qumarxanaları olan kef yeri. *O gecə Əşrəf Əhmədi də özü ilə bərabər kazinoya aparmışdı.* A.Şaiq. *..Lütfəli də fürsəti fövtə verməyib* [Cəlilə] *dedi ki, dur gedək kazinoya, qəhvə içək.* İ.Musabəyov.

**KE** "K" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**KECİNMƏK** b a x **geyinib-kecinmək.** *Aşıq Cünun geyindi, kecindi, pul götürdü, qızıl götürdü, sazını da çiyninə salıb yola düzəldi.* "Koroğlu". [Nəriman:] *Sən demə* [qız] geyinirmiş, keçinirmiş. Mir Cəlal.

**KEÇDİ-KEÇDİ** *is.* Qaçış yarışı (uşaq oyunu). *Keçdi-keçdi oynamaq.*

**KEÇƏ** 1. *is.* Yunu döyüb basmaqla hazırlanan sıx qalın material. *Keçə parçası. Alaçıq keçəsi.* [Dərviş:] *Ruqiyyə bir köhnə keçə üstündə, bir köhnə cırıq kilimdə yatırdı.* A.Divanbəyoğlu. *Göyçək bacı sevincək halda eyvana naxışlı bir keçə saldı.* Ə.Vəliyev. **Keçə atmaq (basmaq)** – yundan keçə hazırlamaq. *Gərək yadındadır, rəhmətlik dədən; Bükülmüşdü beli keçə atmaqdan.* S.Vurğun. // Bu cür materialdan tikilmiş, hazırlanmış. *Keçə papaq. Keçə alaçıq. – Nabat xanım gecə paltarına bürünmüşdü, .. ayağında nazik və səssiz bir keçə başmağı vardı.* M.S.Ordubadi.

2. *məc. sif. mənasında.* Daranmamış, yapıxmış, bir-birinin içinə girmiş (saç haqqında). *Keçə saç.*

**KEÇƏATAN, KEÇƏBASAN** b a x **keçəçi** 1-ci mənada.

**KEÇƏBİÇƏN** *is.* Keçəni biçib, müxtəlif şeylər hazırlayan usta.

**KEÇƏCƏK** *is. dan.* 1. Keçmiş zaman, keçmiş (*gələcək* əksi). [Şamama Cadu:] *Adına qurban olum, xanım, başına dönüm, keçəcəyini pis görürəm, amma gələcəyin yaxşıdır.* Ə.Haqverdiyev. *..Millətin keçəcək və istiqbalını, nicat və səadətini şairanə və ədibanə nəzmə çəkmək, əbnayi-millətin təlim və tərbiyəsinə, ruhani məişətinə qulluq eləmək, əlbəttə, böyük hünərdir.* F.Köçərli.

2. Dolanacaq, güzəran. *Keçəcəyi o qədər də yaxşı deyil.*

3. Asılılıq. *Mənim ondan nə keçəcəyim?*

**KEÇƏÇİ** *is.* 1. Yundan keçə hazırlayan, keçə atan usta; keçəatan, keçəbasan. [Keçmişdə] *Bakıda ümumiyyətlə peşəkarlar:*

*keçəçi, dabbağ, dərzi .. və sairə çox olardı.* H.Sarabski.

2. Keçə hazırlanan və satılan dükan və s.

**KEÇƏÇİLİK** *is.* Keçəçinin sənəti, peşəsi, məşğuliyyəti. [Şah:] *Maldan, mülkdən qəni bir padşah; Keçəçilik sənətin etmiş özünə bir pənah!* Ü.Hacıbəyov.

**KEÇƏXANA** b a x **keçəçi** 2-ci mənada.

**KEÇƏL** *sif.* 1. Baş dərisinin xəstəliyi nəticəsində başının tükü tökülmüş. *Keçəl adam. Keçəl uşaq. // İs. mənasında.* Başı keçəl olan adam. *Keçəl suya gedən deyil.* (Məsəl).

2. *is.* Tüksüz başın vəziyyəti, görünüşü. *Uzunsov başının yan tərəfi parıldayan tələbə də utanıb susdu, keçəlinə gülürdülər.* M.Hüseyn. □ **Keçəl olmaq** – b a x **keçəlləşmək.**

3. *məc.* Ot bitməyən, çılpaq, daz. *Dibində su tapdım – şərbətə bənzər; Keçəl yoxuşların, qozbel diklərin.* M.Araz.

**KEÇƏLBAŞ** *sif.* Başı keçəl (daz) olan. *Keçəlbaş oğlan.*

**KEÇƏLƏKƏRKƏS** *is. zool.* Dağlıq yerlərdə yaşayan, leş və cəmdək yeyən şığıyıcı, caynaqlı quş; toğlugötürən, kərkəs.

**KEÇƏLƏŞDİRMƏ** "Keçələşdirmək"dən *f.is.*

**KEÇƏLƏŞDİRMƏK** *f.* Keçə kimi etmək, tüklərini bir-birinə qarışdırmaq; codlaşdırmaq.

**KEÇƏLƏŞMƏ** "Keçələşmək"dən *f.is.*

**KEÇƏLƏŞMƏK** *f.* Tükləri bir-birinin içinə girib, keçə kimi olmaq, keçə kimi ayrılmaz olmaq, yapıxmaq; codlaşmaq.

**KEÇƏLƏT** *is. məh.* Keçmə, addama yeri. *Arxın* (*çayın*) *keçələti.*

**KEÇƏLLƏMƏ** "Keçəlləmək"dən *f.is.*

**KEÇƏLLƏMƏK** b a x **keçəlləşmək.** *Quraqlıqdan ağaclar keçəlləmişdir.*

**KEÇƏLLƏŞMƏ** "Keçəlləşmək"dən *f.is.*

**KEÇƏLLƏŞMƏK** *f.* 1. Baş dərisinin xəstəliyi nəticəsində başının tükü tökülmək, keçəl olmaq. // Dazlaşmaq, daz olmaq.

2. *məc.* Ot bitməmək, daz olmaq; çılpaqlaşmaq.

**KEÇƏLLƏŞMİŞ** *f.sif.* Keçəl olmuş, başının tükü tökülmüş. // *məc.* Dazlaşmış, çılpaqlaşmış. – *Tula keçəlləşmişdi, adda-budda yerlərdə belinin tükü tökülmüşdü.* İ.Məlikzadə.

**KEÇƏLLİK** *is* 1. Başdan tükü tökən dəri xəstəliyi. *Keçəllik basmaq. // bayt.* Heyvanlarda dəri xəstəliyi nəticəsində tükün tökülməsi. *Keçəllik nəticəsində heyvanların tükləri tökülə bilər.*

2. Başda tük olmadığı hal; dazlıq.

3. *məc.* Bitkisizlik, çılpaqlıq. *Çölün keçəlliyi.*

**KEÇƏN** 1. "Keçmək"dən *f.sif.*

2. *sif.* Bundan əvvəlki, ötən, cari, axırıncı, sonuncu. *Keçən il. Keçən həftə. – Elədimi su yazda; Axar, gedər su yazda; Mən yarı görməmişəm; Keçən yaz da, bu yaz da.* (Bayatı). *Keçən bazar ertəsi günü firqə klubunda teatr konfransı çağırılmışdı.* C.Məmmədquluzadə. [Zeynalın] *keçən gün əli hər yerdən üzülüb, öz dərdini Şərifzadəyə açıb söyləmişdi.* S.Hüseyn.

3. *sif.* Keçmiş, keçib getmiş, vaxtilə olmuş. *Keçən günə gün çatmaz.* (Ata. sözü). [Səfi:] *Ağlaya-ağlaya düşdü yollara; Gələn dərdi, keçən dərdi, yol dərdi.* "Əsli və Kərəm". *Cahandan getdi gileyli; Keçən dövrana bir baxmaz.* Q.Zakir. // Keçən gün, keçmiş hadisə. *Keçənə güzəşt deyərlər.* (Məsəl).

4. **Keçənlərdə** şəklində *zərf* – keçmişdə. *Ürək deyir: Zaman, keçmə, amandur; Keçənlərdə gözüm var, bir dayan, dur!* Şəhriyar. **Keçənlərdən** şəklində – keçmişdən. [Gənc çadırçı:] *Keçənlərdən bizə əfsanə qaldı; Sönüb cəmşidi-cəm peymanə qaldı.* H.Cavid. **Keçənlər** şəklində – keçmiş, olmuş şeylər. *Gəl qardaşım, keçənləri; Yada salaq dönə-dönə.* B.Vahabzadə. // Eyni mənada bəzən "bu" sözü ilə. *Bu keçənlərdə ingilis əfsər (zabit)ləri Misirdə nə səbəbdən isə güllələr atıb, məhəlli əhalidən bir neçəsini vurubdurlar.* Ü.Hacıbəyov.

◊ **Keçən yeri olmamaq** – heç bir güzəşt edilə bilməyəcəyini bildirir. *Məmmədbağırın keçən yeri yox idi.* S.Hüseyn.

**KEÇƏPAPAQ(LI)** *sif.* Başında keçədən papaq olan. *Keçəpapaq kişi.*

**KEÇƏRİ** *sif.* Müvəqqəti, ötəri, keçici, keçib-gedən. *Dünyanın sevinci də; kədəri də ikidir; Biri yüngül, keçəri; xəfif dumana bənzər.* R.Rza.

**KEÇƏTƏPƏN** b a x **keçəçi** 1-ci mənada.

**KEÇİ** *is.* Süd, yun, ət verən buynuzlu ev heyvanı. *Keçi əti. Keçi südü. Keçi balası* (çəpiş). *Anqara keçisi* (çox zərif yunlu keçi cinsi). – *Keçinin əcəli çatanda çobanın çomağına sürtünər.* (Ata. sözü). *Necə bulandırıb keçi bu çayı? Keçi aşağıda, qurd yuxarıda!* B.Vahabzadə. // *məc.* Çox dəcəl, oynaq uşaq haqqında. □ **Keçi kimi** – keçinin hərəkətlərinə təşbeh. [Səkinə Pərşana:] *Gəl, gəl, gedək gəlinimizə çığırtmadanzaddan bişirək, görsün ki, ağlamaqdan, keçi kimi o yan-bu yana tullanmaqdan başqa bir şey də əlindən gəlir.* M.İbrahimov. [Tükəzban xala Zeynəbə:] *Sənin əlindən çal-çəpər də qalmadı. Keçi kimi, hara gəldi dırmaşırsan. Ayaq basmadığın yer yoxdur.* İ.Şıxlı.

◊ **Keçini bostana buraxmaq** *zar.* – bir adamı böyük zərər yetirə biləcəyi yerə buraxmaq.

**KEÇİAYAQ** *sif. dan.* Ayaqları keçi ayağı kimi nazik olan. *Keçiayaq qız uşağı.*

**KEÇİCİ** *sif.* 1. Hər hansı bir yarışda və s.-də yeni qaliblərə, birincilik qazananlara verilən. *Keçici kubok.* – *O kimdir külüngü dağ kimi vurur? Keçici bayraq da yanında durur?* S.Vurğun. *Görünür qabaqda keçici bayraq; Onun yarış adlı şüarı vardır.* H.Arif.

2. Müvəqqəti, ötəri. *Keçici yağış. Keçici sevinc. Keçici həvəs.* – *Bu qara gün keçicidir, bir gün bitər, inləmə; Bağçamızda sarı bülbül yenə ötər, inləmə.* A.İldırım. [Bəxtiyar:] *Yox, Cəlal, bu qədər hissə qapılmaq; Gəncliyin keçici hissidir, ancaq.* S.Vurğun.

3. Bir neçə il davam edən, keçən ildən qalan, gələn ilə qalan. *Keçici mövzu. Keçici məbləğ.*

4. Yoluxucu, yoluxan, keçən. *Keçici xəstəlik.*

**KEÇİCİLİK** *is.* Keçici şeyin hal və keyfiyyəti. *Xəstəliyin keçiciliyi.*

**KEÇİD** *is.* 1. Bir yerdən başqa yerə keçmək üçün yol; keçəcək, keçiləcək yer. *Dağ keçidi* (iki dağ arasında olan dar boğaz). *Çay keçidi* (çayın at ya ayaqla keçilə bilən nisbətən dayaz yeri). – *Keçid başından bəlli olar.* (Ata. sözü). [Əmiraslan ağa:] *Heydər bəy! ..Uçurum dərəsinin keçidini kəs!* S.S.Axundov. *Keçidlərdə baş-başa verən adamlar isə əlləri ilə aşağıları göstərərək bir-birinə nə isə deyirdilər.* A.Şaiq.

2. Bir vəziyyətdən (keyfiyyətdən) başqa vəziyyətə (keyfiyyətə) keçmək üçün olan; aralıq. *Keçid dövrü. Keçid mərhələ.*

**KEÇİDLİ** *sif.* Keçidi olan, keçmək üçün yolu olan (b a x **keçid** 1-ci mənada). *Keçidli dağ.*

**KEÇİQIRAN** *is. dan.* 1. Martın axırlarında olan bərk soyuq. // Ümumiyyətlə, soyuq.

2. Martın sonu və aprelin birinci yarısı.

**KEÇİQULAĞI** *is. bot.* Çiçəklərindən xalq təbabətində istifadə olunan ot bitkisi.

**KEÇİLİŞ** *is.* Keçmək işi.

**KEÇİLMƏK** "Keçmək"dən *məch. Xeyli məsafə keçilmişdir. Körpü keçilmişdi. Mərz keçildi. Dərslər iki növbədə keçilir.* – *..Musiqi və rəqs salonuna keçildi.* M.S.Ordubadi. *Müəllim olmadığından, kənd məktəbində dörd aydan bəri rus və alman dili keçilmirdi.* M.İbrahimov.

**KEÇİLMƏZ** *sif.* 1. Keçmək, hərəkət etmək, getmək, addamaq qeyri-mümkün və ya çətin olan. *Keçilməz cəngəllik. Keçilməz dağ.* – *Allah özü bilir ki, o keçilməz meşələrdə, o çıxılmaz qayalarda Aydəmir bircə sənin xəyalınla yaşayır.* C.Cabbarlı. *Qatar keçilməz yolları oraq kimi kəsib-biçdi; Qarşı gəldikcə daş-qaya bir ox kimi dəlib keçdi.* H.Cavid. *Düzülmüş yan-yana daşlı təpələr; Qurulmuş keçilməz təbii səngər.* H.K.Sanılı. // Hər hansı bir səbəbə görə keçilməsi, addanması çətinləşmiş. *Çaylar daşmış, yollar keçilməz* (z.) *olmuşdu.* – *Biz uca qayalar aşdıq; Keçilməz yollardan keçdik.* Z.Xəlil.

2. *məc.* Son dərəcə yaxşı, gözəl, ürəyə yatan, cəlbedici şey haqqında. [Bəypolad Cəmil bəyə:] *Amma sizin bağçanın çiçəklərindən də keçilməz ha!* H.Cavid.

3. *məc.* Bağışlanmaz, bağışlanması mümkün olmayan, əfvedilməz. *Keçilməz günah.*

**KEÇİLMƏZLİK** *is.* 1. Keçilməsi mümkün olmayan, yaxud çətin olan yerin halı. *Kim isə – qibtələr yaşasın – deyə; Yalan bir varlığa heykəllər qurur; Kiminsə yolunu keçilməzliyə; Yönəltmək naminə tərif yoğurur.* M.Araz.

2. *məc.* Bağışlanmaz, bağışlanması mümkün olmama, əfvedilməzlik.

**KEÇİMƏMƏSİ** *is.* 1. *bot.* Zınqırovçiçəklilər fəsiləsindən ot bitkisi.

2. Azərbaycan oyun havalarından birinin adı. *Təkçalma, uzundərə, keçiməməsi havası ilə gənclər oynayanda yoldaşları onların başına kağız pul* (*əsginas*) *şabaş tökərdilər.* H.Sarabski. [Əhli məclisdən birisi:] *Padşah sağ olsun, ərzim var! Təvəqqe edirəm ki, burada bir keçiməməsi çalınsın və Xudadad bəy də durub oynasın!* Ü.Hacıbəyov.

3. İri uzunsov giləleri olan üzüm növü.

**KEÇİNDİRMƏ** "Keçindirmək"dən *f.is.*

**KEÇİNDİRMƏK** *icb.* Keçinməsinə, dolanmasına, yaşamasına vasitə olmaq; kömək etmək; dolandırmaq, yaşatmaq. [Mirzə Qədir Nəsirə] *ailəsini keçindirə biləcək bir maaş da təyin etməli idi.* S.Hüseyn.

**KEÇİNƏCƏK** *is.* Güzəran, dolanacaq. *Keçinəcəyin necədir?*

**KEÇİNMƏ¹** "Keçinmək¹"dən *f.is.*

**KEÇİNMƏ²** "Keçinmək²"dən *f.is.*

**KEÇİNMƏK¹** *f.* 1. Dolanmaq, yaşamaq, güzəran etmək, baş saxlamaq. *Birtəhər keçinirəm. – Kərim baba naxırı saxladığı, otardığı üçün aldığı cüzi aylıq ilə keçinərdi.* A.Şaiq. [Məsmənin] *maaşı da yaxşı imiş. Firavanlıq ilə keçinir imiş.* S.Hüseyn.

2. Birisi ilə (istər-istəməz) dinc yaşamaq, yola getmək; yola vermək. *Çocuqlarına qarşı bəslədiyi məhəbbət Mehribanı məcbur edirdi ki, Zeynalın "işlərinə" qatlaşıb, bir növ ilə keçinsin.* S.Hüseyn. *Belə bir vəziyyət içərisində katib Sübhanverdizadə ilə bir növ keçinməyi qərara aldı.* S.Rəhimov.

**KEÇİNMƏK²** *f.* Ölmək. *..Amma anam onların köçməyini eşitcək qurtaracaq, yəqin bil ki, haman dəqiqə keçinəcək.* C.Məmmədquluzadə. *Səhər üzü idi, dağlardan əsən sübh küləyinin nəfəsi* [şairi] *üşüdür, Afaq isə artıq keçinirdi.* Ə.Məmmədxanlı.

**KEÇİOTARAN** *is.* Keçi çobanı.

**KEÇİRİCİ** *is. fiz.* Elektrik cərəyanını, səsi, istiliyi və s.-ni öz daxilindən keçirən cisim; naqil. *Elektrik keçiricisi. Maqnit keçiricisi.*

**KEÇİRİCİLİK** *is. fiz.* İstiliyi, səsi, elektrik cərəyanını və s.-ni keçirmə qabiliyyəti. *Maqnit dövrəsinin keçiriciliyi.*

**KEÇİRİLMƏ** "Keçirilmək"dən *f.is.*

**KEÇİRİLMƏK** "Keçirmək"dən *məch.* *Başqa işə keçirilmək. İşçilər yeni sahəyə keçirildi. Açara zəncir keçirilmək. Qərarlar həyata keçirildi. Xərclər idarənin hesabına keçirildi. İşıqlar keçirildi. Ocaqlar keçirilmişdi. Hərbi təlim keçirilmək. Məsələ iclasın müzakirəsinə keçirildi. Məqalə elmi şuradan keçirildi.*

**KEÇİRİM¹** bax **keçid** 1-ci mənada. [Koroğlunun dəliləri] *necə deyərlər, aşırım aşdılar, keçirim keçdilər.* "Koroğlu".

**KEÇİRİM²** *is. fiz.* Elektrikkeçirmə, nəqletmə xassəsi.

**KEÇİRİMLİ** *sif. fiz.* Keçirimi olan (bax **keçirim²**). *Yüksək keçirimli polad.*

**KEÇİRİMLİLİK** *is. fiz.* Elektrikkeçirmə qabiliyyəti.

**KEÇİRMƏ¹** "Keçirmək¹"dən *f.is.*

**KEÇİRMƏ²** "Keçirmək²"dən *f.is.*

**KEÇİRMƏK¹** *f.* 1. Yönəldərək, istiqamətləndirərək bir yerdən keçib getməsinə, ya bir yerə keçməsinə kömək etmək, ya keçməyə məcbur etmək. *Qonaqları yuxarı başa keçirmək. Mal-qaranı çaydan* (*meşədən, körpüdən*) *keçirmək. Sərhəddən qoşun keçirmək. – Rüstəm kişi maşını kəndarası küçələrdən keçirib, palçıqlı araba yoluna çıxdı.* M.İbrahimov. // Yanınca, yaxud qucağında, dalında bir şeyin içərisindən o biri tərəfə aparıb çatdırmaq. *Uşağı çaydan keçirmək. Küçənin o biri səkisinə keçirmək.*

2. Taxmaq, geydirmək. *Barmağa üzük keçirmək. Pəncərənin çərçivəsini keçirmək. İynəyə sap keçirmək. Qol-qola keçirmək. Çəkməni ayağına keçirmək. Yorğana üz keçirmək.*

3. Başqa işə, xidmətə, yerə təyin etmək, qoymaq. *Kiçik elmi işçi vəzifəsinə keçirmək. Uşağı musiqi məktəbinə keçirmək. Ayrı işə keçirmək. Futbol komandasını "B" qrupuna keçirmək.*

4. Maşının və s.-nin iş üsulunu, xarakterini dəyişdirmək. *Zavodu yeni iş üsuluna keçirmək. Təsərrüfat hesabına keçirmək.*

5. Həyata keçirmək, yerinə yetirmək, icra etmək. *İclas keçirmək. Müsabiqə keçirmək. Əkin kampaniyası keçirmək. Hərbi manevr keçirmək.*

6. Yazmaq, aid etmək, daxil etmək. *Məbləği bir hesabdan başqa hesaba keçirmək.* // Bir şeyi (mülkü, hüququ və s.) rəsmi yolla

başqasına vermək, onun adına yazdırmaq. *Evi oğlunun adına keçirmək.*

7. Bir şəxsin duyduğu həyəcan və s. hissləri bildirir. *İztirab keçirmək. – Çox cavan idim, həyəcan keçirirdim.* A.Şaiq. *Azər Mərəndi mütərəddid bir hal keçirirdi.* M.İbrahimov. *Cavahirin keçirdiyi həyəcan Teymuru da get-gedə həyəcanlandırırdı.* H.Seyidbəyli.

8. Bir müddət bir yerdə yaşamaq, olmaq, qalmaq. *Uşaqlığını kənddə keçirmək. Ömrünü fəhləlikdə keçirmək. Köçəri həyat keçirmək. – Düşündüm, düşündüm, axırda gecəni bir qaya altında keçirmək üçün yavaş-yavaş dağa dırmaşdım.* A.Şaiq. [Turxan bəy:] [Cəmil bəy] *..Borjoma gəlmiş, yorğunluğunu çıxarmaq üçün yazı orada keçirəcəkmiş.* H.Cavid. // Bir şəxsin halını, vəziyyətini bildirir. *Ağır həyat keçirmək. Gününü xoş keçirmək. Bütün günü başağrısı ilə keçirmək.* // Vaxtının bir hissəsini bu və ya başqa bir şeyə həsr etmək və ya istifadə etmək. *Vaxtını şən keçirmək. Bütün vaxtını məşğələlərdə keçirmək. Vaxtının çoxunu işdə keçirmək.*

9. *xüs.* Keçiricilik (istilik, elektrik, səs və s.), keçirmə qabiliyyətinə malik olmaq. *Metal istilik keçirir. İzolyatorlar elektrik keçirmir.*

10. *məc.* Ötürmək, sovuşdurmaq. *Rüstəm kişi Qara Kərəmoğlunun sözünü zarafatla keçirmək istədi.* M.İbrahimov.

11. *məc.* Çəkmək, görmək, başına gəlmək. *Xəstəlik keçirmək.*

12. Qəbul etdirmək, təsdiq etdirmək; bir şeyin qəbuluna, təsdiqinə, tətbiqinə nail olmaq. *Məsələni iclasdan keçirmək. Təklifi keçirmək. Layihəni keçirmək.*

13. İsimlərlə yanaşı işlədilib, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: qılıncdan keçirmək, gözdən keçirmək, fikrindən keçirmək, nəzərdən keçirmək.

**KEÇİRMƏK**[2] *f.* Söndürmək. *İşığı keçirmək. Ocağı keçirmək. Tonqalı keçirmək. – Telli lampasını keçirib yatağına uzanmışdı.* S.Hüseyn. [Xasay] *gah taxılı yolub atır, gah taxılın içindəki qatır-quyruğu ilə alovu döyüb keçirirdi.* Ə.Vəliyev.

**KEÇİRTMƏ** “Keçirtmək”dən *f.is.*

**KEÇİRTMƏK** b a x **keçirmək**[1]**.** *Bülbül, keçirtmə bağda qəflətdə ömrünü.* S.Ə.Şirvani. *Keçənlərdə Qafqaz kəndlərindən birində bir neçə vaxt günlər keçirtdim.* N.Nərimanov. [İkinci qadın:] *Gərək bacardıqca seçkidə çox qadın keçirdək.* Ə.Haqverdiyev.

**KEÇİSAQQAL(LI)** *sif.* Seyrək və uzun saqqalı olan. *Keçisaqqal, çəlimsiz bir tələbə aramla deyirdi..* Çəmənzəminli. // İs. mənasında. *Uşaqların “keçisaqqal” deyə ələ saldıqları bu adamların sayı tədricən artdı.* İ.Şıxlı.

**KEÇMƏ**[1] “Keçmək[1]”dən *f.is.*

**KEÇMƏ**[2] “Keçmək[2]”dən *f.is.*

**KEÇMƏK**[1] *f.* 1. Hərəkət edərək, yeriyərək, addımlayaraq irəliləmək, yer dəyişmək, ötüb getmək. *Yolla keçmək. Səki ilə keçərkən yoldaşımı gördüm. – Küçə ilə bir hambal, bir tay dalınca keçir.* C.Məmmədquluzadə. [Kərim xan] *Tehranın sakitləşməyə başlayan küçələrindən keçərkən uzun müddət fikri Xavərdən ayrılmadı.* M.İbrahimov. // Bir sahənin, yerin içindən, ortasından ötüb getmək. *Meşədən keçmək. Kənddən keçmək. – Küçə qapısından girərkən uzun, qaranlıq bir dalanı keçib öz otağıma gedərdim.* S.Hüseyn. *Biz də arxalarından qaçıb yetişdik, dərəni keçdik, kiçik bir cığırla meşəyə doğru dikləndik.* A.Şaiq. // Ayaq və ya miniklə ötüb keçmək, yeriyərək bir şeyi arxada buraxmaq. *Tahirzadə tozlu, üfunətli yerlərdən keçərək daş döşəməli yoxuş küçə ilə dikləndi.* Mir Cəlal. // Sərhəd, mərz və s.-ni addamaq, aşmaq, addayıb keçmək. *Mərzi keçmək. – Bilirsən də, dünən qoşunlarımız Almaniyanın sərhədini keçdi!..* M.Hüseyn. *Atəş halqasını keçmişlər artıq; Zülmətin əlində boğulmaz işıq!* M.Rahim. // Bir şeyin üstü və ya içi ilə yeriyərək, gedərək onu arxada buraxmaq. *Tuneldən keçmək. – Keçmə namərd körpüsündən, qoy aparsın su səni.* (Ata. sözü). *Biz Acı körpüsünü keçib şose yolu idarəsinə çatana qədər iki yerdə vəsiqələrimizi gözdən keçirdilər.* M.S.Ordubadi.

2. Yaşadığı, olduğu yeri dəyişmək, öz yerini dəyişmək. *Nəbi .. Naxçıvan səmtində olan Keçili yaylağına keçir.* “Qaçaq Nəbi”. [Çopo:] *Yaşayış şəraiti fənalaşdığı üçün Cəməsb ailəsini və əqrəbalarını götürərək Aran ölkəsinə keçir.* Çəmənzəminli. // Vəzifəsini, sənətini, işini, yaxud iş yerini, oxu-

duğu yeri dəyişmək. *Başqa işə* (*vəzifəyə*) *keçmək. Tarix fakültəsinə keçmək.* // Bir sinfi (kursu) bitirərək sonrakına daxil olmaq. *Universitetin üçüncü kursuna keçmək. 10-cu sinfə keçmək. – ..Firəngistanda birisi ki istəyir alim ola, gərək gecələr yatmayıb zəhmət çəkə, elm oxuya, bir klasdan o biri klasa keçə.* C.Məmmədquluzadə. *Eldar beşinci sinfi bitirib altıya keçir.* İ.Əfəndiyev.

3. Olduğu yeri tərk edib başqa yerə çəkilmək, girmək, daxil olmaq, içəri girmək. *Kabinetə keçmək. Zala keçmək. – Telli öz otağına keçib, müəllimin otağındakı söhbəti dinləməyə başladı.* S.Hüseyn. *Qarı mən sarıdan arxayın olub, öz otağına keçdi.* M.Hüseyn.

4. Birisini tərk edərək başqasına qoşulmaq, onunla birləşmək. *Düşmən tərəfinə keçmək. Başqa cəbhəyə keçmək.* // Dinini, əqidəsini dəyişib yeni din, əqidə qəbul etmək.

5. *dan.* Bir təşkilata, dərnəyə qəbul olunmaq, daxil olmaq, girmək, üzv olmaq. *Partiyaya keçmək.*

6. Tərzi-hərəkətini dəyişmək, başqa cür hərəkət etməyə başlamaq. *Müdafiədən hücuma keçmək. Qabaqcıl iş üsullarına keçmək.* // Bir şeyin yerinə başqasını tətbiq etməyə başlamaq. *Ciddi pəhrizə keçmək. Müsahibim birdən rus dilinə keçdi.*

7. Bir məsələni, işi bitirib, yaxud yarımçıq qoyub başqasına başlamaq. *Daha yüngül işə keçmək. Məruzə bitdikdən sonra müzakirələrə keçdilər.*

8. Yer tutmaq, bir yerdə qərar tutmaq, dayanmaq. *Məruzəçi tribunanın dalına keçdi. Usta dəzgahın arxasına keçdi.*

9. Müəyyən həddi ötmək, ötüb keçmək. *Saat on biri keçmişdi.* S.Hüseyn. *Dilara saatına baxdı, vaxt keçdikcə ürəyinin döyüntüsü artırdı..* M.İbrahimov. *Vaxt keçir, artıq; Çökəcək dağlara yenə qaranlıq.* Z.Xəlil. // Ötüb-keçmək, başa çatmaq (vaxt haqqında). *Günlər keçir, həftələr dolanır, aylar başa çatır.* "M.N.lətif" [Hacı:] *Keçir əyyam, günü-gündən çoxalır dövlətü-malım.* C.Cabbarlı. ☐ **Gəlib keçmək** – ötmək. *Şaxta vurmayacaq göy zəmiləri; Qış gəlib keçəcək bir bahar kimi.* S.Vurğun.

10. Cərəyan etmək, müəyyən müddət bir yerdə qalmaq, olmaq. *..Dabbağ qəribə bir adam idi. Onun qırx illik ömrünün yarısı məhbəslərdə və sürgünlərdə keçmişdi.* M.İbrahimov.

11. Davam etmək, olmaq. *Bir neçə il idi ki, quraqlıq keçdiyindən ayrımların əkin və biçini əmələ gəlmirdi.* A.Şaiq.

12. Məşğul olmaq, öyrənmək. *Onlar şəhid olub millətimizə; Cəsarət dərsini təlim keçdilər.* B.Vahabzadə.

13. Davam edərək müəyyən nəticə ilə bitmək, sona çatmaq. *Mitinq çox gurultulu keçdi. İmtahanlar müvəffəqiyyətlə keçdi. Məşğələ çox maraqlı keçdi. – Aşağı siniflərdə birinci dərslərim pis keçmədi.* A.Şaiq. [Sevinc Elçinə:] *Məncə, iclas çox yaxşı keçdi.* Z.Xəlil.

14. Bir şeyin (oxumağın, təlimin, müalicənin və s.) müddətini başa vurmaq, yerinə yetirmək. *Hərbi xidmət keçmək. Kurs keçmək. Təcrübə keçmək. Müalicə kursu keçmək.*

15. Oxumaq, öyrənmək. *Dərs keçmək.*

16. İrəlidə olmaq, ötmək. ☐ **Bir-birini keçmək** – bir-birini ötmək üçün yarışmaq. *Qara Kərəmoğlu ilə* [Rüstəm] *yalnız .. kimi bir-birini keçmə həvəsi ilə yarışa girirdilər.* M.İbrahimov. // *məc.* Ötmək, ötüb keçmək, geriyə buraxmaq. *Şagird ustasını keçdi. O bizi çoxdan keçib.*

17. Uçub getmək, uçaraq ötmək. *Bir dəstə quş damın üstündən keçdi. – Hərdənbir kəndin üzərindən durna dəstələri .. keçirdi.* Ə.Məmmədxanlı.

18. Yox olmaq, çəkilmək. *Üzündəki təbəssüm işartısı birdən keçdi. Başının ağrısı keçdi. Uşağın qızdırması keçdi. – Tərəddüdüm çox tez keçdi.* M.S.Ordubadi. // Kəsmək, kəsilmək, dayanmaq, nəhayətlənmək. *Axşamdan yağan yağıntı keçdi. Fırtına keçdi.*

19. Birisinin sərəncamına, ixtiyarına verilmək, birisinə çatmaq, onun malı olmaq. *Mülk varislərin ixtiyarına keçdi. – Əksərən də vaxtında borclarını verə bilməzdilər öz yerləri Əmiyə keçərdi.* N.Nərimanov.

20. *məc.* Birindən o birinə sirayət etmək (adət, ənənə, xasiyyət və s. haqqında). *Bu xasiyyət ona kimdən keçmişdir? – Anasının dediyinə görə, musiqi və şeir həvəsi* [Şirzada] *atası Qasım Kəngərlidən keçmişdir.* M.İbrahimov. // Eyni mənada xəstəlik haqqında.

*Qızılca uşağa keçdi*. // Yayılmaq, başqalarını əhatə etmək. *Yanğın qonşu evlərə keçdi.*

21. *məc.* Təsir etmək, nüfuz etmək, işləmək. *Şaxta* (*soyuq*) *adamın iliyinə keçir.*

22. Yoxlamaya, müayinəyə və s. uğramaq. *Karantindən keçmək. Müayinədən keçmək. Attestasiyadan keçmək.*

23. *məc.* Bağışlamaq, sərfi-nəzər etmək, əfv etmək. *Mənə etdiyin pislikdən keçirəm. Günahından keçmək.*

24. *məc.* Müzakirə, səsvermə nəticəsində qəbul olunmaq, təsdiq edilmək, seçilmək. *Bir səslə keçmək. Səsvermədən keçməmək. Namizəd keçmədi.* – [Zeynəb deyir:] *Xeyr, yoxsullar iclasında keçibdir, gərək otaqları boşaldasan.* Qantəmir.

25. Dəyişmək (paltar, geyim və s. haqqında). *Qış paltosuna keçmək. Papağa keçmək. Yay paltarına keçmək. Qış formasına keçmək* (hərbi ifadə).

26. *məc.* Güzəşt etmək, bağışlamaq, əvəzini istəməmək, vaz keçmək, sərfi-nəzər etmək. *Haqqından* (*iddiasından*) *keçmək.* – [Ağa Mərdan:] *Amma Hacı Qafurun arvadı otuz min tüməndən keçir.* M.F.Axundzadə. *İndidən bunu nəzərə almalıdır ki, bu saat zəngəzurluların nəfi üçün beş manatdan, üç manatdan keçmək bizdən ötrü artıq ziyan edə bilməz.* Ü.Hacıbəyov. // Fəda etmək, əl çəkmək. *Mənafeyindən keçmək.*

27. Yaramaq, qüvvədə olmaq, təsirdə olmaq. *Köhnə pullar indi keçməz. Onun hökmü daha keçmir.*

28. İnkar formasında: **keçməmək, keçə bilməmək** – birinə hörməti olduğuna görə onun xilafına iş görməmək. [Səfər bəy:] *Görünür ki, Qonça xanıma* [Molla Abış] *özü də vurulubdur. Ancaq məndən keçə bilməyir.* B.Talıblı.

29. **Keçib, keçibdir, keçmişdir** şəklində – olub-bitmiş bir iş, hadisə və s. haqqında (adətən güzəşt mənasında işlənir). [Hüseynqulu bəy:] *Gəldim də..., heç, daha keçibdir.* Ü.Hacıbəyov. *Qardaşım, ondan keçibdir.* M.S.Ordubadi.

30. **Keçib-getmək** şəklində – 1) ötüb-getmək. *Keçib-gedən yolçunu öz yolundan eylərsən.* Ə.Cavad. *Geri qayıtmağa tənbəllənib, usta* [Ağabala] *bir təhər .. keçib-getdi.* Çəmənzəminli. *Xədicəgilin faytonları buradan keçib-gedəcəkdi.* S.Hüseyn; 2) yox olmaq, silinib getmək, yaddan çıxmaq, unudulmaq. [Toğrul:] *Bunların hamısını bir tərəfə qoy, mənə tənə vurma, bu yəhərin üstündə çox pəhləvanlar oturubdur. ..Bunların hamısı keçib-gedər, sən də keçib-gedəcəksən.* M.S.Ordubadi.

31. Bir sıra isimlərdən sonra gələrək mürəkkəb fel və ifadələr düzəldilir; məs.: başından keçmək, canından keçmək, pisliyi keçmək, ələ keçmək.

**KEÇMƏK**[2] *f.* Sönmək. *Lampa keçdi. Qaz keçdi. – Od yandı, odu keçdi; Qəlyanın odu keçdi; Aç gözün, qafil ovçu; Maralın, odu, keçdi.* (Bayatı). *Elə bil həyatın nəbzi son zərbəsini vurdu, çıraq keçdi.* Ə.Məmmədxanlı.

**KEÇMİŞ**[1] 1. *f.sif.* Ötən, keçən, ötmüş. *Keçmiş gün. Keçmiş dövr. – Keçmiş vaxtlarda dəftərxanalarda qulluqçuların gündə biri idarə bağlanandan sonra qalıb, təcili məktubları, teleqramları qəbul edərdi.* Ə.Haqverdiyev. [Mirzağa] *hər zaman şikayət edər, keçmiş günləri xatırlar, onların geri qayıtmasını arzu edərdi.* S.Hüseyn. [Araz] *keçmiş zamanlardan edilən söhbətlərə qulaq asmaqdan doymaq bilmirdi.* A.Şaiq. // Əvvəlki, bundan qabaq olmuş. *Keçmiş həyat. Keçmiş səhvləri yada salmaq. – Gurultu içində keçmiş həyatım; Mədəndə açılmış qolum, qanadım.* M.Müşfiq. // Bundan əvvəlki, vaxtilə vəzifə tutmuş, sabiq; əvvəlki vəziyyətini, rolunu, əhəmiyyətini itirmiş. *Keçmiş müdir. Keçmiş əməkdaşlarımız.*

2. *İs. mənasında.* Olub getmiş zaman, ötüb keçmiş zaman, ötüb getmiş vaxt, keçmişdəki həyat, hadisələr. *Keçmişi unutmaq. Keçmişə bir nəzər. Uzaq keçmiş. – Nurəddin fikrə getdi. Bütün keçmiş gözünün qabağından bir-bir gəlib keçdi.* S.S.Axundov. *Keçmişin taleyi sönmüş bu gecə; İşçilər aslana dönmüş bu gecə.* M.Müşfiq. *Keçmiş – dünən olsa belə; O – uzaqdır, gəlməz ələ.* B.Vahabzadə.

3. *Zərf mənasında.* Müəyyən vaxt keçdikdən sonra olmuş, baş vermiş. *Günortadan 3 saat keçmiş gəlib çıxdı. Hadisədən iki gün keçmiş xəbər çatdı. – Bir il keçmiş klubda preferans oynayarkən təsadüfən Həsən bəyə rast gəldim.* B.Talıblı.

4. **Keçmişlər** şəklində *is. mənasında* – keçmiş zaman, dövr (qeyri-müəyyənlik bildirir). *Qeyrilərini bilmirəm, mən indi keçmişlərə nisbətən hər dəfə teatrdan evimizə şad və xürrəm gedirəm.* C.Məmmədquluzadə. *Keçmişlərdə birisi gəlib bir on beş gün qalıb, molla olub gedirdi.* Ə.Haqverdiyev. *Gələcəyi düşündü, keçmişləri çox andı; O gəlib iki yolun ayrıcında dayandı.* B.Vahabzadə.

◊ **Keçmiş zaman** *qram.* – iş və ya hərəkətin keçmişdə icra olunduğunu bildirən fel forması. *Şühudi keçmiş zaman. Nəqli keçmiş zaman.* **Keçmiş ola!** – "artıq əhəmiyyəti yoxdur", "vaxtı keçmişdir" mənalarında ara söz kimi işlədilir. [Şeyx Sədra:] *Hər kimin qəlbi korsa, keçmiş ola! Şeyx Sənanı anlamaz əsla.* H.Cavid.

**KEÇMİŞ**[2] *f.sif.* Sönmüş, söndürülmüş. *Keçmiş ocaq. Keçmiş lampa. – Keçmiş kösövü zor ilə yerə vuranda qığılcım saçılan kimi, dərvişin gözləri məşəlləndi.* A.Divanbəyoğlu.

**KEF** *is.* [*ər.*] 1. Ruhi və ya səhhətcə vəziyyət; hal, əhval. *Kefin necədir? Kefini soruşmaq. Bu gün kefim yaxşı deyil. – Böyükxanım Qulamxanın kefini pərt görüb danışdırmağa cürət etmirdi.* M.S.Ordubadi. [Kərbəlayı Qubad:] *Ağanın kefi, əhvalı necədir?* Ü.Hacıbəyov.

2. Xoş əyləncə, xoş vaxt keçirmə; nəşə. *Kef məclisi. Hər kəs öz kefində. – İş zamanı hamı işdə, məşq zamanı hamı məşqdə, kef zamanı hamı kefdə olardı.* "Koroğlu". *..Bir elə vaxt olmayıb ki, Vəliqulu .. kefə məşğul olsun.* C.Məmmədquluzadə. [Məsud:] *Haqdı əfəndilər: Kef vaxtında kef, iş vaxtında iş! Anlaşıldımı?* H.Cavid.

3. Arzu, həvəs, istək, meyil, könül mənasında. *Kefinə görə danışır. Kefi istəyən kimi hərəkət edir.* – [Sadıq:] *Ay arvad, səni çöldən tapmamışam, hara kefindir aparım.* Mir Cəlal. [Usta Qəzənfər:] *Kefin nə vaxt istəsə, buyur gəl.* Z.Xəlil.

4. **Kefidir (kefimdir)** şəklində *dan. zar.* – bəxti (bəxtim) gətirib, işi (işim) düzəlib. *Dövlətli qoca kişilərin kefidir, ha!* C.Məmmədquluzadə.

◊ **Kef etmək (eləmək)** – bax **kef(ini) çəkmək.** *Ala gözlüm, səndən ayrı düşəli; Hicranın qəmiylə kef eyləmişəm.* Aşıq Ələsgər. [Bəhram:] *Bu gün yerindədir nəşəm; Yaman olmaz bir kef etsəm.* A.Şaiq. **Kef havasına** – özü istədiyi kimi, öz kefi ilə. *Qərəz bütün dövlət, camaat diriliyinin yaraları olan çinovniklər pəncəsindən qurtarıb, millət özü hökm sürən olur və buna görə nahaq yerə döymək, rüşvət almaq, kef havası ilə iş görmək filan-heç biri mümkün olmur.* Ü.Hacıbəyov. **Kef vermək** – ləzzət vermək, nəşələndirmək, şənləndirmək, əyləndirmək. [Sevdim:] *Aşıq, bu gecə bizə gərək elə kef verəsən ki, bir il dadı damağımızdan getməyə.* Ə.Vəliyev. [Xan:] [Burlaxatunu] *gətirin gəlin, bizə şərab paylasın, kef versin!* M.Rzaquluzadə. **Kef yeri** *köhn.* – kef çəkmək, nəşələnmək üçün xüsusi yer, bina və s.; ümumxana. *Minlərcə xəlvətxanalar, meyxanalar və kef yerləri mövcuddur.* M.S.Ordubadi. **Kef(in)dən qoymaq (eləmək)** – nəşədən, büsatdan, səfadan məhrum etmək, nəşəsini pozmaq. **Kef(ini) çəkmək** – şənlənmək, zövq almaq, vaxtını xoş, nəşə ilə keçirmək. *Aparıb ver şərabə, nuş eylə; Məst olub, kef çəkib, xürüş eylə.* S.Ə.Şirvani. [Barat Şərifə:] *Mən? Mən* [Almazın] *yanında kef çəkmişəm?* C.Cabbarlı. **Kef(ini) sürmək** – kef çəkmək, kefdə olmaq, kefə baxmaq. *Ovuc-ovuc pulları alıb doldurur cibinə, kefini sürür.* S.Rəhman. [Əliş:] *Mən axmaq deyiləm, gələm yer əkəm; Bəylər kef sürələr, mən zəhmət çəkəm.* Z.Xəlil. **Kefdə olmaq** – bax **kef(ini) çəkmək**. *Zərnigar baxıb gördüm ki, bağbanın oğlu Murquz bunun bağında bir qıznan kefdədi.* (Nağıl). **Kefdən düşmək** – bax **kefi pozulmaq**. **Kefə baxmaq** – vaxtını kefdə keçirmək, əylənmək. *Əyləndim, baxdım kefə; Gürcülərin toyunda.* Ə.Cavad. *Olmazmı bir maşında gedib düşək bir evə; Gəzək restoranları, baxaq bir yerdə kefə!* S.Rüstəm. **Kefə batmaq** – kef içində olmaq, kef çəkmək. **Kefi açılmaq** – şadlanmaq, könlü açılmaq, fikri dağılmaq, əhvalı yaxşılaşmaq. *Hovuza girən qaşqabaqlı çıxmazdı, qəmgin adam da oraya girsəydi, kefi açılardı.* Çəmənzəminli. [Gülpəri Nurəddinə:] *Dərslərin qurtarandan sonra da yoldaşlarını götürüb gəzməyə get ki, kefin açılsın.* S.S.Axundov. **Kefi ala dağda olmaq** – bax **kefi kök olmaq.** *Firidun dörd ildir nər*

*kimi vuruşur, bu saat onun kefi ala dağdadır.* M.Hüseyn. **Kefi duru olmaq** – b a x **kefi durulmaq. Kefi durulmaq** – 1) b a x **kefi açılmaq.** *Kefin durulanda, könlün olanda; Bizə gələn ayaqların var olsun.* Xəstə Qasım. *..Dalğaların ağ köpükləri çoxalanda elə bil onun kefi durulub könlü açılır.* M.Hüseyn; 2) keflənmək, nəşələnmək (içkidən). *Məclis quruldu, keflər duruldu; Saqi dolandı, ruh təzələndi.* "Koroğlu". [Əliş Əzizə:] *İştahan çəkirsə, mən ölüm, bir vur; Vuranda adamın kefi durulur.* Z.Xəlil. **Kefi gəlmək** – birdənbirə həvəsə gəlmək, əhvalı yaxşılaşmaq. *Keçən gün bazarda bir karvansaranın qabağında bir rəfiqimlə söhbət etdikdə birdən kefim gəldi, başladım bu misranı oxumağa.* N.Vəzirov. **Kefi istəmək** – arzulamaq, arzusunda olmaq. *..Xudayar bəyin əlində yekə dəyənək var, nə vaxt kefi istəyir qaldırır, nə vaxt kefi istəyir endirir.* C.Məmmədquluzadə. **Kefi istəyəndə** – istədiyi vaxt, ürəyi istəyəndə. **Kefi kök (kefi kök, damağı çağ) olmaq** – şad, nəşəli, sevinc içərisində olmaq, əhvali-ruhiyyəsi yaxşı olmaq, dərdi-qəmi olmamaq. [Məşədi İbad:] *Sənin dövlətindən kefim çox kökdür.* Ü.Hacıbəyov. *Bu gün Əsgər ağanın kefi kök idi, heç bir təzə* [vergi] *icad eləmək fikrində deyildi.* S.Rəhman. *Kefi kök olanda aşıq, şübhəsiz; Ya nişandan gəlir, ya toydan gəlir.* H.Arif. **Kefi kökəlmək** – b a x **kefi açılmaq**. *Əlimərdan evinə gəldi, yedi, içdi, kefi kökəldi.* (Nağıl). [Musanın nəvəsi ilə atasının dostunun] *kefləri kökəldi.* Qantəmir. **Kefi qalxmaq** – b a x **kefi kökəlmək.** *Kefi qalxdı, fikri duruldu, öz-özünə səbəbsiz yerə gülməyə başladı.* S.Rəhman. **Kefi qarışmaq (qarışıq olmaq)** – b a x **kefi pozulmaq**. *Günlərin bir günü Ülkər Kövkəb xanımla kefdə idi. Birdən-birə onun kefi qarışdı.* (Nağıl). *Bəbir bəyin də kefi qarışıq idi.* Mir Cəlal. **Kefi olmamaq** – 1) əhvalı yerində olmamaq. *Adamın kefi olmayanda da şəkil çəkdirməyə gələr?* S.Vəliyev; 2) özünü xəstə kimi hiss etmək, balaca xəstə olmaq. *Uşağın kefi yoxdur.* **Kefi özündə olmamaq** – 1) özünü yaxşı hiss etməmək; 2) əhvalı pozğun olmaq. *..Kefi özündə olmadığını, nə isə, çox gərgin düşündüyünü Şəmsiyyə* [Hikmət İsfahaninin] *simasından bildi.* M.İbrahimov. **Kefi pozulmaq** – ovqatı təlx olmaq, pərt olmaq, nəşəsi qaçmaq. *Həkimülmülk pis bir vəziyyətə düşdü. "Yox" desə, Hikmət İsfahaninin kefi pozulacaq və bəlkə, tərsliyə salıb, Mazəndəran malikanəsini verməyə razı olmayacaqdı.* M.İbrahimov. **Kefi saz (kefi saz, damağı çağ) olmaq** – b a x **kefi kök (kefi kök, damağı çağ) olmaq.** *Ellərin kefi sazdır; Bu yaz bir başqa yazdır.* M.Müşfiq. *Əhmədin kefi saz, damağı çağdır.* Mir Cəlal. **Kefi sazalmaq** – b a x **kefi kökəlmək.** *Görürsən nənəm ilə bir saat oturanda necə kefi sazaldı?* Mir Cəlal. **Kefi yerində olmaq** – normal vəziyyətdə olmaq. **Kefi yuxarı olmaq** – b a x **kefi kök olmaq**. [Qaçay:] *Bu gur işıq o deməkdir ki, Mahmud evdədir və kefi çox yuxarıdır.* Z.Xəlil. **Kefimin o vaxtı deyil** – vəziyyətim, halım, əhvalım yaxşı deyil. [Odabaşı Xudayar bəyə:] *A kişi, sən Allah, zarafat eləmə. Mənim kefimin o vaxtı deyil.* C.Məmmədquluzadə. **Kefindən qalmamaq** – daim kef, nəşə içərisində yaşamaq. *Kərim baba heç bir şeyə əhəmiyyət verməyib, nəşəsindən, kefindən qalmazdı.* A.Şaiq. *O ki özü, dünyanın; Bir kefindən qalmayıb.* N.Rəfibəyli. **Kefinə bax** – necə istəyirsən, özün bil. *Öz kefinə bax, kişi, dad ver, dad al! Qoy babalın boynuma, get, arvad al!* M.Ə.Sabir. **Kefinə buraxmaq** – özbaşına buraxmaq, istədiyi kimi hərəkət etməyə imkan vermək. [Qızıl Arslan:] *Lakin bu dəfə sizi əvvəlki kefinizə buraxmayacağam.* M.S.Ordubadi. **Kefinə dəymək** – ürəyini sındırmaq, ürəyinə dəymək. *Qəssab Alı fikirləşdi ki,* [Koroğlu] *belə danışır, bunun kefinə dəyib, Eyvazı əlindən almaq heç kişilikdən deyil.* "Koroğlu". *Kefinə dəymə, söyə ya sənə, ya qardaşına.* M.Ə.Sabir. [Tükəzban xala:] *Cavandır, kefinə dəymə... Şəhər yerinin adəti budur.* Qantəmir. **Kefinə soğan doğramaq** – qanını qaraltmaq, nəşəsini qaçırmaq, dilxor etmək. [Miri:] *..Canım, kefimizə soğan doğrama!* M.Hüseyn. *Yavərin oynaq gözlərində bir ocağın nuru var, üzündə bir dünyanın sevinci var – bu anında onun kefinə soğan doğramaq insafdan, kişilikdən deyil.* İ.Məlikzadə. **Kefinə toxunmaq** – b a x **kefinə dəymək.** *Bu söz .. Molla Məmmədəlinin kefinə*

*toxundu.* S.Rəhman. **Kefinə yatmaq (gəlmək)** – xoşuna gəlmək, ürəyindən xəbər vermək. **Kefini açmaq** – fikrini, qəmini, kədərini, dərdini dağıtmaq; nəşələndirmək. *Aşığı görəndə Mahmud bəy çox sevindi ki, bunu bir az oxutdurub kefini açsın.* "Qurbani". *Əlisa, hirslənmiş ağsaqqal həkimin kefini açmağa çalışdı.* S.Rəhimov. **Kefini durultmaq** – b a x **kefini açmaq**. **Kefini kök eləmək (saxlamaq)** – 1) nəşələndirmək, ruhlandırmaq, şadlandırmaq. [Çoban:] *Oğlan, əhvalatdan mən də indi xəbərdar oldum.. Pəri cadunun yanında öz kefini kök saxla.* Ə.Haqverdiyev; 2) **kefini kök elə! (et!)** şəklində – təskinlik məqamında və ya kinayə ilə "darıxma, fikir etmə" mənasında. **Kefini qarışdırmaq** – b a x **kefini pozmaq**. *Əgər xəbər alsan Molla Səfini; Doğru-dürüst qarışdırıb kefini.* Q.Zakir. **Kefini pozmaq** – əhvalını pozmaq, kədərləndirmək, qanını qaraltmaq, nəşəsini dağıtmaq. *Kefini heç pozma, Vətən qardaşı; Əzilər dediyin ilanın başı.* S.Vurğun. *Havanın pozulması Zərrintac xanımın da kefini pozdu.* S.Rəhimov. **Nə kefdəsən?** – birisinin əhvalının, səhhətinin, güzəranının necə keçdiyini soruşarkən işlədilən ifadə. *Cümşüd bəy dedi: – Salaməleyküm, qonşu, nə kefdəsən?* E.Sultanov. **Öz kefində olmaq (gəzmək)** – başı kefə qarışmaq, kefdə olmaq. *Quşlar öz keflərində idilər.* A.Divanbəyoğlu. *Hərə öz kefində idi.* S.Rəhman. *Xanımlar öz keflərində idilər, gülmək, danışmaq öz qaydası ilə davam edirdi.* Ə.Vəliyev. **Öz kefinə** – 1) istədiyi kimi, özü bildiyi kimi; 2) nəşə ilə, nəşələnə-nəşələnə, şənlənə-şənlənə. *Cavan, eşşəyin noxtasını boşlayıb, onu özbaşına buraxdı, eşşək harın yorğa yerişlə öz kefinə gedirdi..* E.Sultanov. *Öz başlarına buraxılmış atlar öz kefləri ilə addımlayırdılar.* S.Rəhimov.

**KEFAL** [*yun.*] *zool.* Yanlardan basıq, uzun bədəni olan dəniz balığı.

**KEFALKİMİLƏR** *cəm. zool.* Kefal və bəzi başqa balıqların daxil olduğu fəsilə.

**KEFCİL** b a x **kefçi.** *Bu adamın hərəkətindən və simasından gəncliyində çox igid və kefcil bir dəliqanlı olduğu anlaşılırdı.* A.Şaiq. *Əziz əyri-əyri Zeynala baxdı. Bu baxışlarından hiss edilirdi ki, onun bu qırmızısifət, kefcil oğlandan o qədər də xoşu gəlmir.* Ə.Əbülhəsən.

**KEFCİLLİK** *is.* Kef çəkməyi sevmə, vaxtını kefdə keçirmə, içkiyə aludəlik. [Mirzə Cəmil:] [Paşa bəyi] *öldürsə, elə bu kefcillik öldürəcək.* Ə.Vəliyev.

**KEFÇİ** *is.* və *sif.* 1. Vaxtını kefdə keçirən, kef çəkməyi sevən adam; kefcil. *..Teymur ağa həm məşhur kefçi, həm də nüfuzlu və vurub-yıxan cavanlardan idi.* M.S.Ordubadi.

2. *məc.* Öz danışığı, hərəkəti ilə başqalarının kefini açan, başqalarını əyləndirən adam haqqında.

**KEF-DAMAQ** b a x **kef** 2-ci mənada.

◊ **Kef(də)-damaqda olmaq** – b a x **kefdə olmaq** ("**kef**"də). *O vaxt xanların dəmi hələ saz idi, xanlar gələcəklərini bilməyib, öz keflərində-damaqlarında idilər.* E.Sultanov. **Kefə-damağa baxmaq** – b a x **kefə baxmaq** ("**kef**"də). *Əziziyəm bu dağa; Bu bağçaya, bu dağa; Aş barıdan, dolan gəl; Baxaq kefə-damağa.* (Bayatı). **Kefi-damağı kökəlmək** – b a x **kefi kökəlmək** ("**kef**"də). *..Biləndər dilləndiyi zaman, Səməndər kefi-damağı kökəlmiş halda ucadan güldü.* M.Hüseyn.

**KEF-ƏHVAL** b a x **kef** 1-ci mənada. [Kərbəlayı Qubad:] *Ağanın kefi-əhvalı necədir?* Ü.Hacıbəyov. *Tahir .. həm Nərgizin özünün, həm də ata-anasının kefini-əhvalını soruşdu.* M.Hüseyn.

**KEFXANA** *is.* [*ər.* kef və *fars.* xanə] Kef çəkilən yer, kef yeri.

**KEFİR** *is.* Qatığa oxşar, süddən qatı qidalı içki.

**KEFLƏNDİRİLMƏ** "Kefləndirilmək"dən *f.is.*

**KEFLƏNDİRİLMƏK** *məch.* İçki və s. içirdilib kefli edilmək; sərxoşlandırılmaq.

**KEFLƏNDİRMƏ** "Kefləndirmək"dən *f.is.*

**KEFLƏNDİRMƏK** *icb.* İçki və s. içdirib kefli etmək; sərxoşlandırmaq.

**KEFLƏNMƏ** "Keflənmək"dən *f.is.*

**KEFLƏNMƏK** *f.* İçib məst olmaq, kefli hala düşmək; sərxoşlanmaq. [Mozalanbəy:] *Gördüm qarabağlıdır, bərk keflənib.* Ə.Haqverdiyev. [Qonaqlar] *tamamilə keflənməmişdilərsə də, yarımsərxoş bir halda bulunurdular.* S.Hüseyn. *Çoxları mey içdi meyxanə-*

*lərdə; Kefləndi, amma ki, Xəyyam olmadı.* M.Rahim.

**KEFLİ** *sif.* 1. İçki içərək keflənmiş; sərxoş. *Kefli adam. – Rəşid bəy bərk kefli idi, ona görə də nə dil aça bildi, nə bir söz dedi, ancaq zarıldayıb zıqqıldayırdı.* E.Sultanov.

2. B a x **kefçi** 2-ci mənada.

**KEFLİ-DAMAQLI** b a x **kefçi** 2-ci mənada. *Biri kefli-damaqlı; Birinin ömrü boyu; Nəsibi hicran oldu.* H.Arif.

**KEFLİ-KEFLİ** *zərf* Kefli halda, sərxoş halda.

**KEFLİLİK** *is.* Kefli adamın halı; sərxoşluq, məstlik.

**KEFSİZ** *sif.* 1. Yüngül xəstə, naxoş, azarlı. *O dəm deyir biri dustaqların: – Bəradərlər! Nə var, neçün belə kefsiz, fikirlisiz yeksər?* A.Səhhət. ☐ **Kefsiz olmaq** – b a x **kefsizləmək** 1-ci mənada. *Gülpəri bir qədər kefsiz olduğu üçün axşamdan yatmışdı.* S.Hüseyn.

2. *məc.* Kədərli, qəmgin, halı pərişan, məyus, pərt. *Niyə belə kefsizsən? – Nəbigil İsmayılın tutulmasından çox kefsiz* (z.) *oldular.* "Qaçaq Nəbi". [Gülnaz:] *Sərvər, bu gün səni çox kefsiz* (z.) *görürəm, nə olub məgər?* Ü.Hacıbəyov.

**KEFSİZCƏSİNƏ** *zərf* Kefsiz halda, kefsiz bir tərzdə, qəmgincəsinə, pərişancasına. *Bir gün işdən qayıdan zaman Cəmilə xanım kefsizcəsinə Əhmədi qarşıladı.* S.Rəhimov.

**KEFSİZLƏMƏ** "Kefsizləmək"dən *f.is.*

**KEFSİZLƏMƏK** *f.* 1. Yüngül xəstələnmək, naxoşlamaq, azarlamaq. *Uşaq kefsizləyib.*

2. *məc.* Kədərli və pərişan olmaq, qəmginləşmək, məyuslaşmaq. [Zərrintac xanım:] *..Həftəbaşı .. ərinin kefsizləməyini istəmir.* S.Rəhimov.

**KEFSİZLƏNDİRMƏ** "Kefsizləndirmək"dən *f.is.*

**KEFSİZLƏNDİRMƏK** *icb.* 1. Yüngül xəstələnməsinə, naxoşlamasına, azarlamasına səbəb olmaq. *Uşağı soyuğa verib kefsizləndirmək.*

2. *məc.* Kədərləndirmək, pərişan etmək, qəmginləşdirmək, məyus etmək. *Xəbər onu kefsizləndirdi.*

**KEFSİZLİK** *is.* 1. Azca xəstəlik, naxoşluq.

2. *məc.* Əhval pozğunluğu; pərişanlıq, qəmginlik, məyusluq, pərtlik. *Arvad Zeynalı bu axşam kefsiz gördü, lakin bu kefsizliyə ayrıca məna vermədi.* Çəmənzəminli. [Gülsənəm] *kefsizliyinin səbəbini xəbər alanlara çox könülsüz cavab verirdi.* M.Hüseyn.

**KEKS** [*ing.* cake, cəmi cakes] Yumurta, şəkər vurulmuş, kişmişli xəmirdən bişirilən, şirin çörək növü. *Qozlu keks.*

**KEQL¹** [*alm.*] Müəyyən qaydada düzülmüş çəlikləri ağac şarla vurub yıxmaqdan ibarət oyun. *Keql oynamaq.* // Həmin oyunda işlədilən çəliklər.

**KEQL²** [*alm.*] Mətbəə hürufatı ölçüsü.

**KELTLƏR** *cəm.* Qədim zamanlarda Qərbi Avropada yaşamış tayfalardan biri. ☐ **Kelt dilləri** – Hind-Avropa dilləri ailəsi qruplarından biri.

**KENQURÚ** [*ing.* əsli Avstraliya dilindən] *zool.* Qabaq ayaqları qısa, dal ayaqları uzun, hoppana-hoppana gəzən, hərəkət edən kisəli heyvan (Avstraliya və Yeni Qvineyada yayılmışdır).

**KEPKA** [*rus.* əsli *fr.*] Günlüyü olan yumşaq kişi baş geyimi. *Drap kepka. Qara kepka. Kepkasını çıxarmaq. – Nimdaş kepkasını çıxardıb yaş əlini başının dazına çəkəndə Bağırın canına bir sərinlik yayıldı.* İ.Məlikzadə. *Dama-dama kepkamdan; zolaq-zolaq köynəyimdən; bir də ləng yerişimdən; tanıyarsan məni.* R.Rza.

**KEPKALI** *sif.* Başında kepka olan, başına kepka qoymuş. *Kepkalı oğlan.*

**KERÁMİKA** [*yun.*] Dulusçuluq məmulatı; saxsı istehsalı; dulusçuluq. *Keramika istehsalı.*

**KERATÍN** [*yun.* keras – buynuz] Buynuz, yun, lələk, saç və s.-də olan zülali maddə.

**KERATÍT** [*yun.* keras – buynuz] *tib.* Gözün buynuz qişasının iltihabı.

**KEROQÁZ** [*rus.*] Ağ neftlə yanan qızdırıcı cihaz – səssiz primusun bir növü.

**KEŞAKEŞ** [*fars.*] b a x **keşməkeş.** *Tab etməyib keşakeşi-sevdayə; Fərhad dağa qaçdı, Məcnun səhrayə.* Q.Zakir.

**KEŞİK** *is.* Qarovul, güdük; qoruma. ☐ **Keşik çəkmək** – 1) qarovul çəkmək, bir obyekti qorumaq. *Dəlilər .. dağın dörd tərəfində keşik çəkərdi.* "Koroğlu". [Əbdül:] *Məni malların keşiyini çəkmək üçün qoyublar.* C.Cabbarlı. [Gənclər] *şəhərin, insanların keşiyini çəkirlər.* H.Seyidbəyli. // Məc.

mənada. *Lay-lay beşiyim, lay-lay; Evim-eşiyim, lay-lay; Sən get şirin yuxuya; Çəkim keşiyin, lay-lay.* (Layla). [Muxtar dayı Nərgizin anasına:] *İki əsgər kimi* [Nərgizin] *sağında-solunda dayanıb keşiyini çəkəcəyik.* Ə.Məmmədxanlı; 2) *məc.* dayanıb gözləmək, izləmək, güdmək. *Səhərdən burada keşik çəkirəm. – Ağcaqız bir tərəfdə bunların keşiyini çəkməkdə olsun.* "Aşıq Qərib". **Keşikdə durmaq (dayanmaq, olmaq)** – b a x **keşik çəkmək.** *Qalmışam eşikdə mən; Bir qızıl beşikdə mən; Yar bağçaya gələndə; Duraram keşikdə mən.* (Bayatı). **Keşiyində durmaq (dayanmaq)** – qoruyub müdafiə etmək. *Vətənin keşiyində durmaq. – Yuxusunu alan Həcər də gün çırtlar-çırtlamaz yerindən qalxıb ərinin keşiyində dayandı.* S.Rəhimov. *..Burada sərhədin keşiyində duranlar .. yalnız rəsmi sərhədçilər deyil.* M.Rzaquluzadə.

**KEŞİKÇİ** *is.* Adətən silahlı surətdə keşik çəkən, mühafizə edən, qoruyan adam; qarovulçu. *Keşikçilər Eyvazgili aparıb saldılar dama.* "Koroğlu". *Bir-iki nökər yüyürüb, şəhər qapısı keşikçilərinə xəbərə getdi.* Çəmənzəminli. *Kənd içində .. batalyon keşikçisindən başqa kimsə görünmürdü.* Ə.Əbülhəsən. // Məc. mənada. *..Gecələr bu dilrübanın keşikçisi, gündüzlər qulu oldum.* A.Divanbəyoğlu.

**KEŞİKÇİBAŞI** *is. köhn.* Keşikçilərin başçısı, böyüyü. *Keşikçibaşıya xəbər verdilər.* M.S.Ordubadi.

**KEŞİKÇİLİK** *is.* Keşikçinin işi, vəzifəsi; qarovulçuluq.

**KEŞİKXANA** *is.* Keşikçilərin olduğu, yerləşdiyi bina; qarovulxana. *Onların dalınca sarayın keşikxana qulamları çıxdı.* P.Makulu.

**KEŞİŞ** *is.* Xristianlarda: yepiskop ilə dyakon arasında ruhani rütbəsi və bu rütbəni daşıyan ruhani. [İblis Arifə:] *İç də, bax, sonra duyarsan nə imiş; Ən gözəl töhfə, keşiş göndərmiş.* H.Cavid. *Ədalətin şərbətinə; İlk dəfə kim zəhər qatdı? Keşişləri, Həmzələri; Kim yaratdı; Nə yaratdı?* B.Vahabzadə.

**KEŞİŞLİK** *is.* Keşişin vəzifəsi, işi. *Keşişlikdən çıxdın, erməniliкdən ki çıxmamısan.* (Ata. sözü). [Keşiş:] *Bu axundluqla keşişliyi boynumuza qoyub, dünyanı bizə haram eləyiblər...* Çəmənzəminli.

**KEŞİŞSİFƏT** *sif.* Keşiş kimi uzun saqqalı olan; görünüşcə, qiyafəcə keşişə oxşayan. *Hamı boynu zəncirli, keşişsifət, uzun çalsaqqal, qarapaltar kişinin ağzından çıxacaq hökmün necə olacağına müntəzir idi.* Mir Cəlal.

**KEŞKƏ** *is. məh.* 1. Dərinin üzərində əmələ gələn ərp. *Əli keşkə atıb.*

2. Quru meyvənin üstündə şəkərdən əmələ gələn ağ qat. *Əncir qurusu keşkə atıb.*

**KEŞKƏL** *is. məh.* 1. Əkin yerinə çəkilən kiçik su arxı. *Dar bir su keşkəlinin yanındakı dəyədə atlarını saxladılar.* S.Rəhman.

2. Kiçik çay və ya arxın üstündən keçmək üçün uzadılmış tir, ağac.

**KEŞKƏLƏNMƏ** "Keşkələnmək"dən *f.is.*

**KEŞKƏLƏNMƏK** *f. məh.* Keşkə atmaq, üstü qabıq tutmaq.

**KEŞKƏLİ** *sif. məh.* Keşkə atmış, keşkəsi olan. *Keşkəli əncir qurusu.*

**KEŞMƏKEŞ** *is.* [*fars.*] Çəkhaçək, çəkişmə, dartışma.

**KEŞNİŞ** *is.* Yeyilən, xörəyə tökülən xoşiyli göyərti növü. *İki dəstə keşniş. Xörəyə keşniş tökmək. Keşniş doğramaq. – Bədnal atı nallıyan vaxtda yumşaltmaqdan ötrü məsləhət edirlər ki, bir dəsmala bir neçə damcı keşniş ətri töküb onun burnuna tutsunlar.* "Əkinçi".

**KEY** *sif.* Hissiz, duyğusuz, süst; cansız kimi. *Key adam. Key* (z.) *olmaq. – Biçarə kişi, qanmağa başın hələ keydir; Axır mənə bir söylə görüm, elm nə şeydir?* M.Ə.Sabir. *Durna key bir qorxu ilə ananın gözlərinə baxdı..* İ.Əfəndiyev.

**key-key** *zərf* Key halda, süst halda. *Tarıverdi yerə düşüb, key-key Məcidin qabağına yeridi.* S.Rəhimov.

**KEYBƏND** *is.* Üzü hamar, astarı tüklü saya palaz növü. [Dərviş:] *Qoca arvad bir kilim, bir keybənd gətirdi.* A.Divanbəyoğlu.

**KEYF** b a x **kef.** [Əliməmməd:] *Necə belə bayramlar görək, keyfimiz kök, damağımız çağ olsun!* Çəmənzəminli. *O mühəndis qıza, o doktor qıza; Mən də şeir yazım keyfim gələndə.* M.Müşfiq.

**KEYFİYYƏT** *is.* [*ər.*] 1. Bir şey və ya şəxsi başqasından fərqləndirən xüsusiyyət,

əlamət (əsasən, müsbət xüsusiyyət, əlamət). *İnsanın ən yaxşı keyfiyyəti. – Yoxsa bu keyfiyyətə rah neçin verməyir? Gah verir filməsəl, gah neçin verməyir?* M.Ə.Sabir.

2. Bir şeyin dəyərlik, yararlıq, ləyaqət dərəcəsi. *Hər yerdə kəmiyyət, keyfiyyət barəsində danışıq gedirdi.* S.Hüseyn. *Dərs keyfiyyəti uğrunda ciddi mübarizə aparırlardı.* S.Rəhimov.

3. Fəlsəfədə: əşyanı, hadisəni və ya prosesi, onun başqa şey deyil, məhz özü olduğunu müəyyənləşdirən xüsusiyyət. *Kəmiyyət və keyfiyyət. Kəmiyyətin keyfiyyətə keçməsi qanunu* (dialektikanın əsas qanunlarından biri).

4. Qəziyyə, vəziyyət, hadisə. [Hacı Nuru şair:] *Hələ bir qulaq asın,* [şeri] *oxuyum, görün bu keyfiyyəti necə bəlağət və fəsahətlə bəyan etmişəm.* M.F.Axundzadə. *Çünki qarı bildi bu keyfiyyəti; Özgə sayaq oldu onun niyyəti.* A.Səhhət. *Səhər qızın atası, Hacı Əbdüləzimin dükanına gedib keyfiyyəti söylədi.* Ə.Haqverdiyev.

**KEYFİYYƏTCƏ** *sif.* Keyfiyyətinə görə fərqlənən. *Keyfiyyətcə yaxşı mal. Keyfiyyətcə pis mal.*

**KEYFİYYƏTLİ** *sif.* 1. Müəyyən keyfiyyətə malik olan. *Yaxşı keyfiyyətli. Orta keyfiyyətli.*

2. Keyfiyyətcə yüksək olan; yaxşı, əla. *Keyfiyyətli mal. Keyfiyyətli polad.*

**KEYFİYYƏTLİLİK** *is.* Müəyyən keyfiyyətə malik olan şey və s.-nin xüsusiyyəti, halı.

**KEYFİYYƏTSİZ** *sif.* Keyfiyyəti pis olan; pis, alçaq. *Keyfiyyətsiz mal. Keyfiyyətsiz material.*

**KEYFİYYƏTSİZLİK** *is.* Keyfiyyətsiz şey və s.-nin xüsusiyyəti, halı.

**KEYİDİCİ** bax **keyləşdirici.** *Keyidici dərman.*

**KEYİKDİRİLMƏ** “Keyikdirilmək”dən *f.is.*

**KEYİKDİRİLMƏK** bax **keyləşdirilmək.**

**KEYİKDİRMƏ** “Keyikdirmək”dən *f.is.*

**KEYİKDİRMƏK** bax **keyləşdirmək.**

**KEYİKMƏ** “Keyikmək”dən *f.is.*

**KEYİKMƏK** bax **keyimək.**

**KEYİMƏ** “Keyimək”dən *f.is.*

**KEYİMƏK** *f.* 1. Hərəkət qabiliyyətini itirmək, qurumaq, çəng olmaq, keyləşmək. *Hatəm xanın qolu keyiyib dondu, onun gözü pər-pər çaldı.* S.Rəhimov. [Səlbinin] *ayağı elə keyimişdi ki, barmaqlarını kəssəydilər xəbəri olmazdı.* Ə.Vəliyev.

2. *məc.* Hiss və dərk etmə qabiliyyətini itirmək, donub qalmaq, quruyub qalmaq; kütləşmək, süstləşmək. *Şeir adı eşidəndə cəmi vücudum keyidi, başım fırlanmağa başladı.* Çəmənzəminli. *Yenə güllə atılırdı, lakin Tərlanın qulaği keyimişdi.* M.Hüseyn. // *məc.* Azalmaq, zəifləmək, keçmək. *Ağrısı bir az keyimişdi.*

**KEYİMİŞ** *f.sif.* 1. Hərəkət qabiliyyətini itirmiş, çəng olmuş; qurumuş. *Keyimiş əl. – Talıb xanla yasavul üzüyuxarı qalxıb, qapıdan bir az aralıda keyimiş halda yerə düşdülər.* S.Rəhimov. [Qızın] *keyimiş dizləri sanki hissini itirmişdi.* Mir Cəlal.

2. *məc.* Keyləşmiş, süstləşmiş, kütləşmiş, donub qalmış. *Həkimülmülkün keyimiş idrakı vəziyyəti dərk edəcək halda deyildi.* M.İbrahimov.

**KEYİŞMƏ** “Keyişmək”dən *f.is.*

**KEYİŞMƏK** bax **keyimək.** *Qədir həm yorulmuş, həm də qıçları sanki tutulmuş, keyişmişdi.* Mir Cəlal.

**KEYİTMƏ** “Keyitmək”dən *f.is.*

**KEYİTMƏK** bax **keyləşdirmək.** *Həyəcanlı sözlər soyuq su damlaları kimi Zibeydənin üzərinə tökülüb, onu keyitdi.* Çəmənzəminli. *Həkimin verdiyi ağır xəbər elektrik cərəyanı kimi* [qızın] *qəlbinə çarpıb, bütün əsəblərini keyitmişdi.* İ.Əfəndiyev.

**KEYLƏŞDİRİCİ** *sif.* Keyləşdirən, key edən, hissizləşdirən. *Keyləşdirici iynə* (*dərman*). *– Yerli təsir göstərmək üçün* [dərmanlara] *antiseptik, büzücü, keyləşdirici, ağrıkəsici və başqa maddələr daxil edirlər.* R.Əliyev.

**KEYLƏŞDİRİLMƏ** “Keyləşdirilmək”dən *f.is.*

**KEYLƏŞDİRİLMƏK** *məch.* Key edilmək; hissizləşdirilmək.

**KEYLƏŞDİRMƏ** “Keyləşdirmək”dən *f.is.*

**KEYLƏŞDİRMƏK** *f.* 1. Key hala salmaq; hissizləşdirmək. *İynə vurub əti keyləşdirmək.*

2. *məc. dan.* Keyləşməsinə, süstləşməsinə, donub qalmasına səbəb olmaq; sarsıtmaq. *Bu xəbər onu keyləşdirdi.*

**KEYLƏŞMƏ** "Keyləşmək"dən *f.is.*

**KEYLƏŞMƏK** b a x **keyimək.** *Gülnaz, hiss və duyğuların keyləşdiyi, ilk məhəbbətin açılmadan solduğu, ümidsizlik içərisində daşa dönmüş qəlbini ərbaba verdi.* M.İbrahimov. *Sənubər başı keyləşənə .. qədər oxudu.* B.Bayramov.

**KEYLİK** *is.* 1. Keyləşmiş, hissizləşmiş şeyin halı. *Əlin keyliyi.*

2. *məc.* Süstlük, kütlük, hissizlik. *Şirin özündə bir keylik hiss edirdi.* İ.Əfəndiyev.

**KEYSU** *is.* [*fars.*] *klas.* Uzunsaç, zülf, hörük. *Belə türrə, belə keysu, – belə saç; Belə qəmzə, belə qaşü göz olmaz.* Q.Zakir. *Firqətindən qara bağrım olub su; Alıbdır qərarım o zülfü keysu.* Aşıq Məhəmməd.

**KƏBƏ** *is.* [*ər.*] 1. Məkkədə müsəlmanların müqəddəs saydıqları bina – qibləgah. *Ey həqqi hər yerdə hazırdır deyən əgrinəzər; Bəs nə mənada seçərsən Kəbədən bütxanəni?* Nəsimi. [Şeyx Nəim:] *Eylədin Kəbə qarşısında yəmin; O bu gün məhv olurmu bir qız için?* H.Cavid. // *məc.* Əsas, mərkəz. *Mərhum Molla Tarqulu həmişə deyərdi ki, Danabaş kəndi yer üzünün Kəbəsidir, yəni mərkəzidir.* C.Məmmədquluzadə.

2. *məc.* Ən əziz, ən istəkli, ən müqəddəs sayılan şey haqqında. [İmran:] *Onun Kəbəsi mücrüdür ki, gündə yeddi dəfə başına dolansın.* S.S.Axundov.

**KƏBİN** *is.* [*fars.*] *köhn.* 1. Evlənmə əsnasında kişi (oğlan) tərəfindən qadına (qıza) vəd edilən nikah bahası; başlıq, mehr. [Mərcan bəy:] *..Qabaqda axmaqlıq edib, kəbin pulunu beş min manat yazdırmışam.* Ü.Hacıbəyov. *Arvad bədbəxt olub atası evində qalardı. Atası da axund otağında, divanxanalarda kəbin və talaq davası edərdi.* H.Sarabski.

2. İzdivac, nikah; evlənmənin qanuni şəklə salınması. *Kəbin əhvalatını bitirməkdən ötrü əvvəlcə mənim bu əqdim .. qeyd olunmalı idi.* T.Ş.Simurq. ☐ **Kəbin kağızı** – kəbin şərtlərinin yazıldığı kağız, evlənmə haqqında şəhadətnamə. *Hər birisi ki razı olsa, onda gərək dübarə Abbas Məhəmməd oğluna nikah oxuna və kəbin kağızı yazıla..* M.F.Axundzadə. *Kəbin kağızını almamış gəlini bayıra çıxarmazdılar.* H.Sarabski. **Kəbin kəsdirmək** – evlənməsini müvafiq mərasimlə qanuni şəklə saldırmaq. [Ağamehdi] *.. kəbin kəsdirdi və* [Gülnazı] *götürüb öz evinə apardı.* E.Sultanov. **Kəbin kəsmək** – evlənmə ayini icra etmək, evlənməyi qanuni şəklə salmaq, nikah kəsmək. *İrəvanda bir belə mirzənin hətta kəbin kəsdiyini görmüşəm.* Ə.Haqverdiyev. **Kəbinini kəsmək** – ərə getməsini qanuni şəklə salmaq. [Molla Səfi:] *Pəh, bu olmadı ha! Mənə deyən gərəkdi, həpənd, bu nə şəriətbazlıqdı... Kəbinini kəsəydin qurtaraydı gedəydi...* N.Vəzirov. **Kəbinini vermək** – boşamaq, talağını vermək. [Şamama cadu:] *Onun da fikrini çəkəcəksən? Bir yüz manat puldur, onun kəbinini verib, başından rədd elərsən, gedər işinə.* Ə.Haqverdiyev.

◊ **Kəbin(lər)i göydə kəsilib** – evlənmələri tam zəruridir. *Əmiqızı ilə əmioğlunun kəbini göydə kəsilib.* (Məsəl). [Allahqulu Çimnaza:] *Sən də çalış, Sonanı Bülənddə gəlin gətir, bir-birini onlar çox istəyirlər. Hər cəhətdən də babdırlar. Belələri üçün deyiblər ki, kəbinləri göydə kəsilib!* Ə.Əbülhəsən. **Kəbinim halal, canım azad**! *köhn.* – adətən qadının məcburiyyət üzündən ərindən boşanmaq arzusunu bildirən ifadə. [Güllü:] *Kağızımı ver, kəbinim halal, canım azad!* Ə.Haqverdiyev. [Mərcan bəy Kəblə Qubada:] *Amma əgər sən bir iş görə bilsən ki, arvadım mənə deyə: kəbinim halal, canım azad və məndən çıxıb gedə, onda sənə iki min manat nağd pul verərəm.* Ü.Hacıbəyov. **Kəbininə kəsilmək** *məc.* – daim boynunda olmaq, boynuna qoyulmaq (bir iş, vəzifə).

**KƏBİNLİ** *sif.* Kəbini olan; qanuni. [Səkinə xanım:] [Zeynəb] *qardaşıma kəbinli arvad deyil idi ki, irs apara.* M.F.Axundzadə. [Bahadır:] *A kişi, nə deyirsən? Kəbinli qızı da qaçırmaq olurmu?* N.Nərimanov. *..Zeynəb, Allaha şükür, dul övrətdi, heç kəbinli də deyil.* C.Məmmədquluzadə.

**KƏBİNLİLİK** *is.* Kəbinli olma, kəbini olma, nikahlılıq.

**KƏBİNSİZ** *sif.* Kəbini olmayan, rəsmi nikahı olmayan; qeyri-qanuni. *Kəbinsiz arvad.* – [Qaçay:] *Onsuz da Pənah çoxdan tutulmalı idi. Lap Əntiqəni evlərinə kəbinsiz aparan günü...* İ.Məlikzadə.

**KƏBİNSİZLİK** *is.* Rəsmi nikahın olmadığı hal; nikahsızlıq.

**KƏBİR** *sif.* [*ər.*] *klas.* Böyük. // İs. mənasında. [Koroğlu:] *Qol-qola bağlayın, tutun əsiri; Səğirin kəbirə qatın, gətirin!* "Koroğlu".

**KƏBLEYİ** *köhn.* "Kərbəlayı" sözünün canlı dildə işlənən forması (b a x **kərbəlayı**). [Səfərəli:] *Kəbleyi! Sən başa düşmürsən.* H.Nəzərli.

**KƏBUTƏR** *is.* [*fars.*] *klas.* Göyərçin. *Bir damdə gördü bir kəbutər.* Füzuli. *Neçə müddət qərq oldular tufana; Əmr etdi, kəbutər gəzdi hər yana.* Aşıq Ələsgər.

**KƏC**[1] *sif.* [*fars.*] 1. Əyri. *Qoy börkünü kəc qaşının üstünə, fırılda; Kəndin kimi bir lotiyimeydanını görcək.* M.Ə.Sabir. *İri, tutqun gözü, acıqlı qaşı; Etinasız, qürurlu, kəc baxışı.* A.Səhhət. **Kəc baxmaq** – əyri baxmaq, pis niyyətlə baxmaq, pis gözlə baxmaq, etibarsızlıq göstərmək. *Ustadına kəc baxanın gözlərinə qan damar.* (Ata. sözü). [Mirsadıq:] *Hərgah başınızdakı papaqdırsa, sizi ona and verirəm, mənim arvad-uşağıma kəc baxmayın.* M.S.Ordubadi. *Qorxmamışıq dost görünən düşmənlərin qınağından; Toy tutmuşuq kəc baxanın göyünə də, ağına da.* R.Rza.

2. Tərs, höcət. *Kəc adam.* – [Qapıçı:] *Yaxşı tanıyıram kəc Əxistanı; Ya məni boğazdan çəkdirər dara; Ya da ki, saldırar daş zindanlara.* M.Rahim. ☐ **Kəc başlamaq** – tərsliyə başlamaq, inad eləmək, ziddinə getmək, əksinə hərəkət etmək. [Məmişov:] *Sən ki mənimlə kəc başladın, mən də məsələni yuxarılara keçirərəm.* M.İbrahimov. **Kəc danışmaq** – əksinə danışmaq, tərs-tərs danışmaq.

**KƏC**[2] b a x **gəc.**

**KƏCAVƏ** *is.* [*fars.*] Keçmişdə Şərqdə: səfərə çıxan adlı-sanlı adamlar üçün minik heyvanlarının, adətən, dəvənin üstündə düzəldilən örtülü yer. *Nigar xanımı atdan düşürüb, kəcavəyə mindirdilər.* "Koroğlu". [Fazil:] *..Bu vilayətdə olan dəli kişilərin övrətləri .. gərək öz ərlərinin qardaşlarına siğə olub bu kəcavələrə əyləşsinlər.* C.Məmmədquluzadə. *Qadınların istiqbalçı qafiləsi taxt-rəvan və kəcavələrdə gedir və hər kəsin nəzərini özünə cəlb edirdi.* M.S.Ordubadi.

**KƏCBİN** *sif.* [*fars.*] *köhn.* 1. Çəpgöz, qıyıqgöz, çaş. *Kəcbin adam.*

2. *məc.* Əyri gözlə baxan, hər şeyi əyri görən, yaxşı bir şey görməyən, xeyirxah olmayan. [Böyükxanım] *şəhla gözlərin insaniyyətcə nə qədər kəcbin olduğunu düşünmüşdü.* M.S.Ordubadi.

**KƏCBİNLİK** *is. köhn.* 1. Çəpgözlük, çaşlıq.

2. *məc.* Pis nəzərlə baxma, hər şeyi tərs görmə, heç bir yaxşı şey görməmə.

**KƏCQABIRĞA** *sif.* və *is. dan.* Tərs, inadcıl, höcət. *Kəcqabırğa adam.* – *Mən onun ağzı xeyrə açıldığını görməmişəm. Zalım oğlu kəcqabırğadır.* Mir Cəlal.

**KƏCLİK** *is.* 1. Qıyqaclıq, çəplik.

2. Tərslik, höcətlik. *Dediyim sözümdə mən yenə varam; Məndə kəclik də var, mərdanəlik də.* Ə.Vahid.

**KƏCMƏDAR** *sif.* [*fars.* kəc və *ər.* mədar] *klas.* Birisinin istək və arzusunun əksinə hərəkət edən; nəhs. *..Mansur axırıncı dəfə fələkdən şikayət etmək üçün ağlar gözlərini göyə dikib tutqun və dilsuz kəlmələrlə təkəllümə başladı: – Kəcmədar dövran!* C.Cabbarlı.

**KƏCPAPAQ** *sif.* 1. Papağını yan qoyan.

2. *məc.* Forslu, qürrəli. *Kəcpapaq oğlan.*

**KƏCRƏFTAR** *rif.* [*fars.*] Pis rəftarlı, rəftarı olmayan, yola getməyən. // *məc.* Nəhs, tərs, uğursuz. *Ey Vidadi, gərdişi-dövrani-kəcrəftarə bax; Ruzigarə qıl tamaşa, karə bax, girdarə bax.* M.P.Vaqif.

**KƏDƏR** *is.* [*ər.*] Qəm, qüssə, dərd, ruhi iztirab. [Maral:] *Uff, bəxtiyarlıq içində ölmək, kədərlər, üzüntülər içində yaşamaqdan min qat xeyirli imiş...* H.Cavid. *Neçəsində fərəhim var; Neçəsində kədərim var.* B.Vahabzadə. *Səmədin ürəyini sonsuz bir kədər və ümidsizlik doldurdu.* İ.Hüseynov. // **Kədərlə** şəklində zərf – qəmli, qüssəli, dərdli. *Kədərlə başını aşağı dikmək. Kədərlə cavab vermək.* – *Azərbaycanda sevinc və şadlığa səbəb olan bu xəbər Həmədanda böyük bir kin və kədərlə qarşılandı.* M.S.Ordubadi.

**KƏDƏRAVƏR** *sif.* [*ər.* kədər və *fars.* ...avər] *klas.* b a x **kədərləndirici.** [Aslan] *zəifləmişdi, qırışıq üzünü tük basmışdı, kədəravər bir görkəm almışdı.* C.Cabbarlı.

**KƏDƏRƏNGİZ** *sif.* [*ər.* kədər və *fars.* ...əngiz] *klas.* b a x **kədəravər.** *Torpaqların üzərinə sərilmiş əlvan güllərin görünüşü qanlı bir otağın görünüşü qədər kədərəngizdir.* M.S.Ordubadi.

**KƏDƏRLƏNDİRİCİ** *sif.* Kədər gətirən, qüssə gətirən; qəmləndirən, qüssələndirən. *Kədərləndirici hadisə. Kədərləndirici xəbər. Kədərləndirici mənzərə.*

**KƏDƏRLƏNDİRİCİLİK** *is.* Kədər gətirmə, kədər vermə.

**KƏDƏRLƏNDİRİLMƏ** "Kədərləndirilmək"dən *f.is.*

**KƏDƏRLƏNDİRİLMƏK** *məch.* Qəmləndirilmək, qüssələndirilmək, məyus edilmək, dərd (kədər) verilmək.

**KƏDƏRLƏNDİRMƏ** "Kədərləndirmək"dən *f.is.*

**KƏDƏRLƏNDİRMƏK** *f.* Kədərli etmək, qəmləndirmək, qüssələndirmək, çox məyus etmək. *Xəbər onu kədərləndirdi. Uşağın xəstəliyi ananı kədərləndirdi. – Bu .. kişinin sonsuzluğu Ataşı istər-istəməz kədərləndirirdi.* Ə.Vəliyev. [Elçin Sevincə:] *İndi mən buraya gələndə eşitdiyim bir səs məni çox kədərləndirdi.* Z.Xəlil.

**KƏDƏRLƏNMƏ** "Kədərlənmək"dən *f.is.*

**KƏDƏRLƏNMƏK** *f.* Kədərə batmaq, qəmlənmək, qüssələnmək, çox məyus olmaq. *Bu xəbərdən kədərləndi. Oğlunu görə bilmədiyi üçün kədərləndi. – Sabir düşünür, kədərlənir, dərslərini hazırlamağa çalışırdı.* S.Rəhimov. *Səfər kişi bu sözdən kədərlənmiş kimi köksünü ötürdü.* Mir Cəlal.

**KƏDƏRLİ** *sif.* Qəmgin, dərdli, mükəddər, hüznlü. *Kədərli ana. – Kədərli bir qəlbin yanıq fəğanı; Yandırır ürəyi daşdan olanı.* Ə.Cavad. *Doğrudan da qız çox düşkün və kədərli idi.* M.İbrahimov. // Kədər ifadə edən. *Kədərli gözlər. Kədərli səs. Kədərli sifət.* // Kədər verən, kədər gətirən, qəmgin edən; kədərlə dolu. *Kədərli xəbər. Kədərli hekayə. – Bu böyük itki, bu kədərli faciə bütün qohum-qardaşa, xüsusən Atabalaya çox ağır təsir etdi.* A.Şaiq.

**KƏDƏRLİLİK** *is.* Kədərli adamın hal və vəziyyəti; qüssəlilik, qəmlilik, dərdlilik.

**KƏDƏRSİZ** *sif.* Kədəri olmayan, qəmsiz, qüssəsiz, dərdsiz. *Kədərsiz adam. // məc.* Şən, qayğısız, məsud. *Kədərsiz həyat. – Nadir bulunur bizdə bulud, sis; Şən ruhumuzun üfqü kədərsiz.* H.Cavid.

**KƏDƏRSİZLİK** *is.* Kədərsiz adamın halı; qəmsizlik, qüssəsizlik.

**KƏF**[1] *is.* [*fars.*] Köpük (od üstündə bişən xörək və s.-də). *Xörəyin kəfini götürmək. Sabun kəfi. – Qazan daşdı, kəfin al; Qaynadıqca kəfin al.* (Bayatı). *Mən əti doğrayıb qurtaranda Gülqədəm düyünün kəfini yığırdı.* Ə.Vəliyev.

◊ **Kəf getmək** *dan.* – oğurlamaq, çırpışdırmaq, qoparmaq. **Kəf gəlmək** – hiylə işlədərək aldatmaq, kələk gəlmək. *Gərək bu xəzinədardan göz olum ki, müştərilər bizim bu başısoyuğa kəf gəlməsinlər.* "Kirpi". **Kəfə getmək** – araya salıb mənimsəmək, özünə götürmək. [Salamov:] *Adə, Bahadır bəy, sən ərinin yanında sırğalardan balaca söhbət sal, yoxsa qızıl sırğaları kəfə gedər, əri bilməz.* C.Cabbarlı.

**KƏF**[2] b a x **kəfə**. *Əlinin kəfi qabar çalıb.*

**KƏFƏ** *is.* [*ər.*] Ovuc, əlin içi, aya. *Bir az kənarda bir övrət çömbəlib və çənəsini hər iki əlinin kəfəsinə qoyub qaşqabaqla Əhmədin ağlamasına tamaşa edirdi.* C.Məmmədquluzadə.

**KƏFƏN** *is.* [*ər.*] 1. Meyitin sarındığı ağ, bez. *Kəfən oğrusundan adamlıq ummazlar.* (Ata. sözü).

2. Keçmişdə: zəvvarların, dindar, mövhumatçı müsəlmanların dini ayinlər zamanı geydikləri kəfənə oxşar uzun ağ paltar.

3. *məc.* Ölüm rəmzi kimi. *Azəri torpağı son kəfənimdi; Doymaram bu qara bezimdən mənim.* M.Araz.

4. *məc.* Ağ örtük. *Göylər matəmlilər kimi qara çarşaba bürünmüş, dağlar, çöllər ağ kəfənlə örtülmüşdür.* A.Şaiq.

◊ **Kəfəni saralmamış** – ölümündən az müddət keçmiş. **Kəfəni yırtmaq** – ağır, təhlükəli xəstəlikdən qurtarmaq (durmaq). [Şofer:] *Qardaşım .. özü də yaralanıb, xəstəxanaya düşüb, amma yenə kəfəni yırtıb çıxıbdır.* M.Hüseyn. **Kəfənini boynuna (boğazına) dolamaq (salmaq)** – cəsarətlənmək, ürəklənmək, özündən güclü bir adamla mübarizəyə girişmək. *İskəndər kişi kəfənini boğazına dolamışdı. Qorxularından cınqırını çəkməyən adamlar, qocanın mərdliyinə heyran qalmışdılar.* M.Hüseyn.

**KƏFƏNLƏMƏ** "Kəfənləmək"dən *f.is.*

**KƏFƏNLƏMƏK** *f.* Meyiti kəfənə bürümək, kəfənə tutmaq. *Səlim* [qocanı] *mafəyə*

*qoydu, yudu, kəfənnədi, həmin dediyi gül ağacının dibində basdırdı.* (Nağıl). [Vəzir:] *Kənarda bir meyit var idi, götürdük. Gətirib kəfənlədik və qəbrə qoyduq.* Çəmənzəminli.

**KƏFƏNLƏNMƏ** "Kəfənlənmək"dən *f.is.*

**KƏFƏNLƏNMƏK** *məch.* Kəfənə bürüdülmək, kəfənə tutulmaq.

**KƏFƏNLİ** *sif.* 1. Kəfəni olan; kəfənlənmiş. *Kəfənli meyit.*

2. *köhn.* Boynuna kəfən salmış, kəfən geymiş (bax **kəfən** 2-ci mənada). *Ağ kəfənli adamlar zikr deyib, başlarını gorda ilə yarırdılar.* Çəmənzəminli. *Arxadan sükut içərisində kəfənli zəvvarlar gəlirlər.* Ə.Məmmədxanlı.

**KƏFƏNLİK** *is.* Kəfənə yarar, kəfən üçün işlədilən parça. *Pambığın hər qozası düşmənə; Olmalı bir kəfənlik.* R.Rza. *Kimsə qara gün üçün yaxdanda saxladığı kəfənliyini gətirdi, meyiti kəfənləyib cənazəyə qoydular və üstünə kəlağayı örtdülər.* İ.Şıxlı. // Sif. mənasında. *Ana .. səliqə ilə qatlayıb özü üçün saxladığı kəfənlik ağa baxdı.* Ə.Əbülhəsən.

**KƏFƏNSİZ** *sif.* Kəfəni olmayan, kəfənlənməmiş. *Kəfənsiz meyit.* // Zərf mənasında. *Meyiti kəfənsiz* (z.) *basdırmaq. – Meynələrində qora; İlişdim, düşdüm tora; Səni mənnən eləyən; Kəfənsiz getsin gora.* (Bayatı). *Qoxudu dağ-dərə barıtdan, qandan; Kəfənsiz cəsədlə doldu biyaban.* Şəhriyar.

**KƏFFARƏ** *is.* [*ər.*] Dindarların, öz günahlarını bağışlatmaq ümidi ilə verdikləri sədəqə, tutduqları oruc və s. *Mənə meydən keçən gün tövbə verdi şeyx, ey Seyyid; Bu gün mən də alıb mey, şeyx üçün kəffarə göndərdim.* S.Ə.Şirvani. □ **Kəffarə vermək** – müsəlmanlarda: günahı yumaq üçün bir şey (sədəqə) vermək. [Çiçək xanım:] *Sənin sifətini görən sill tapar, gərək kəffarə versin.* N.Vəzirov.

**KƏFGİR** *is.* [*fars.*] 1. Xörəyin kəfini götürmək, plov çəkmək və s. üçün işlədilən deşik-deşik alət, böyük qaşıq. [Çayçı] *əlində kəfgir gah plov qazanına baxır, gah tavaya nəzər yetirirdi.* M.İbrahimov. *Göyçək arvad əlində kəfgir aş süzürdü.* Ə.Vəliyev.

2. Yuxarı ucu hərəkətsiz bir nöqtəyə bərkidilmiş yellənən mil, ox (divar saatlarında). *Divar saatının kəfgiri. – Kərimbəy .. kəfgiri ahəstə-ahəstə hərəkət edən .. saata baxdı.* Mir Cəlal. *İri mis kəfgir ağır-ağır çıqqıldayırdı.* Q.İlkin.

3. Duşun, susəpənin deşik-deşik olan hissəsi. *Su, kəfgirin yekə bir deşiyindən fışqıraraq töküldü.* M.Hüseyn.

**KƏFGİRLİ** *sif.* Kəfgiri (2 və 3-cü mənalarda) olan. *Kəfgirli saat. Kəfgirli susəpən. – Katibə xala kəfgirli divar saatına, sonra öz qiymətli qol saatına baxdı.* S.Rəhimov. *Qoca .. ağzı kəfgirli aftafa ilə güllərə-çiçəklərə, su verirdi.* M.Hüseyn.

**KƏFLƏMƏ** *is. dan.* Toz halında dərman. *Kinə kəfləməsi.*

**KƏFLƏNMƏ** "Kəflənmək"dən *f.is.*

**KƏFLƏNMƏK** *f.* Qaynadılan zaman köpüklə örtülmək. *Ət kəfləndi.*

**KƏFLİ** *sif.* Kəfi olan, köpüyü olan; köpüklü. *Kəfli dolma.*

**KƏFRƏM** *is. məh.* Mitil. [Ataş Əsgər bəyə:] *Döşəklərin yununu boşaldıb, yorğanların kəfrəminə baxdıran kimdir?* Ə.Vəliyev.

**KƏFRƏMLİ** *sif.* Kəfrəmi olan; mitilli.

**KƏHƏR** *sif.* Açıq-şabalıdı rəng (at haqqında). *Qurbanəli bəyin nökəri bir kəhər atın çilovundan yapışıb bir az kənarda dolandırırdı.* C.Məmmədquluzadə. *Kişnəyəcək qaşqa, kəhər atım mənim; Xallı toplan ayağına dolaşacaq; Kənd qızları təzə xəbər danışacaq.* M.Araz. // *İs. mənasında.* Həmin rəngdə olan at. *Kəhərə minmək. Kəhəri çapmaq. – Kəhərin sinə bəndi; Ovçunun binə bəndi; Mən dərddən qaçaq oldum; Dərd məndə binələndi.* (Bayatı).

**KƏHİLDƏMƏ** "Kəhildəmək"dən *f.is.*

**KƏHİLDƏMƏK** *f. məh.* Çətinliklə, tövşüyə-tövşüyə nəfəs almaq; ləhləmək, tövşümək. *Tövlənin qapısı açıldı və cahıllar kəhildəyə-kəhildəyə* (z.) *atları töyləyə çəkib, kişmiş taylarını sürüyüb saldılar tövlənin bucağına.* C.Məmmədquluzadə. *Kişi kəhildəyib yerində eşələndi, kürəkləri bir də səslənib xırtıldaşanda nəfəsi genişləndi.* B.Bayramov.

**KƏHİLTİ** *is.* Dərindən nəfəs alarkən çıxarılan səs.

**KƏHKƏŞAN** *is.* [*fars.*] *şair.* Gecələr göy üzündə ağ yol şəklində görünən ulduzlar topası; hacılar yolu, süd yolu. *Kəhkəşan süd-*

*lü nəhri andıraraq; Əzəli bir kitab oxurdu mana.* H.Cavid. *Hər ulduzun yeri var kəhkəşanlar içində; Hər nəhrdən su vardır göy ümmanlar içində.* R.Rza.

**KƏHRƏBA** *is.* [*fars.*] Müxtəlif xırda bəzək şeyləri qayrılan qatranlı şəffaf, sarı və ya sarı-qonur rəngli bərk maddə. *Kəhrəbadan qayrılan muncuq. Kəhrəbadan bilərzik.* // Həmin maddədən qayrılmış bəzək (şeyi). *Gümüş biləklərin, bəyaz qolların; Sarı kəhrəbası, hayıf ki, yoxdur.* M.P.Vaqif. [Bülənd] *bir hərəkətlə Nazlının boynundakı kəhrəbaların və muncuqların hamısını dartıb qopardı..* Ə.Əbülhəsən.

2. Kəhrəbadan qayrılmış. *Kəhrəba qolbaq. Kəhrəba müştük.* – [Molla Sadıq] *sarı kəhrəba təsbehinin qoz boyda dənələrini şaqqıldatdı.* İ.Şıxlı.

3. *məc.* Təşbehlərdə. *Kəhrəba kimi qaymaq. Kəhrəba kimi un. – Dönmüş kəhrəbaya sular xəzəldən; Əlində cam tutmuş ruzgar xəzəldən..* M.Müşfiq. *Sevil açdığı süfrəni daha da zənginləşdirir, yağlı süd, qalın qaymaq, sarı kəhrəbanı andıran şit kərə və pendirlə doldururdu.* S.Rəhimov.

**KƏHRƏBALI** *sif.* Kəhrəbası olan, kəhrəba ilə bəzədilmiş, kəhrəbadan düzəldilmiş. *Kəhrəbalı bilərzik.*

**KƏHRİMƏ** "Kəhrimək"dən *f.is.*

**KƏHRİMƏK** *f. məh.* Qocalmaq, qartlamaq. *Sümüyü kəhrimiş adam. Ağac kəhrimişdir.*

**KƏHRİZ** *is.* [*fars.*] Yeraltı su yolu, su kəməri. *Dərədə kəhriz suyu ilə işləyən stansiyanın təzə binası ağarırdı.* M.Hüseyn. *Yalnız qoşa kəhrizin böyründən gələn araba yolu ilə bir avtomobil sürətlə .. gəlirdi.* Mir Cəlal. □ **Kəhriz vurdurmaq (saldırmaq, çıxartdırmaq)** – suyu quyu vasitəsilə yer üzünə çıxartdırmaq. *..Hər dəfə müsəlmanların müsəllaya çıxmaqları ilə Allah yağış yağdırsa, dəxi bundan sonra bir kəs dəli deyil ki, arx çıxartsın, .. kəhriz vurdursun..* C.Məmmədquluzadə.

**KƏHRİZLİ** *sif.* Kəhrizi olan. *Kəhrizli bağ.* – [Gəray ağa] *..fikrən öz kəhrizli mülklərinə, Qarabağa qayıdır, Müqim bəyin qarasınca mırıldanırdı.* S.Rəhimov.

**KƏHRİZŞEYTANI** *is. zool.* Qarınayaqlılar fəsiləsindən dayaz sularda, kəhrizlərdə yaşayan canlı.

**KƏKƏ** *sif.* Danışarkən kəkələyən; kəkov. *Kəkə uşaq. Anadan kəkə* (z.) *doğulmaq.*

**KƏKƏLƏMƏ** 1. "Kəkələmək"dən *f.is. Onun danışanda kəkələməsi və adı Qəhrəmana sabiq yoldaşı Meracı xatırladırdı.* Ə.Vəliyev.

2. Danışarkən bəzi səsləri qeyri-iradi olaraq dəfələrlə təkrar etməkdən ibarət nitq nöqsanı.

**KƏKƏLƏMƏK** *f.* 1. Danışarkən bəzi səsləri qeyri-iradi təkrar edərək çətinliklə danışmaq. *Qızı elçilər danışdırırlar ki, görsünlər, qız kar deyil, eşidirmi, lal deyil və kəkələmir.* R.Əfəndiyev. // *məc.* Nə deyəcəyini bilməyib dili çaşmaq, dili söz tutmamaq, qırıq-qırıq danışmaq. *Nəsrəddin başlayır kəkələməyə..* "M.N.lətif." *Burada müqəssir kəkələdi və cavab verə bilmədi.* H.Nəzərli.

2. B a x **kəkələnmək.**

**kəkələyə-kəkələyə** *zərf* Kəkələyərək, dili dolaşa-dolaşa, çaşa-çaşa, dili topuq çala-çala. *Nə kəkələyə-kəkələyə danışırsan? – Laçının əmisi kəkələyə-kəkələyə deyirdi.* M.Hüseyn.

**KƏKƏLƏNMƏ** "Kəkələnmək"dən *f.is. Rüstəm kişinin yaşına layiq olmayan şəkildə xoruzlanıb kəkələnməsi Qoşatxana əvvəlcə pis təsir etsə də, getdikcə mənasız və gülünc görünməyə başlayırdı.* M.İbrahimov.

**KƏKƏLƏNMƏK** *f.* Xoruzlanmaq. *Bizi heç bir vaxt aldada bilməzsiniz, – deyə .. polis xəfiyyəsi kəkələndi.* M.Hüseyn. *..Çar məhkəməsinin məmurları bir vaxt Rüstəmin qara damını eşmiş, yararlı bir şey tapmadıqları üçün Rüstəmin üstünə kəkələnmişdilər.* S.Rəhimov. [Şahpəri:] *Bura bax! Özün də mənim üstümə kəkələnmə!* B.Bayramov.

**KƏKƏLİK** *is.* Kəkə adamın halı; kəkovluq. *Kəkəliyindən utanmaq.*

**KƏKƏMƏ** "Kəkəmək"dən *f.is.*

**KƏKƏMƏK** b a x **kəkələmək.**

**KƏKİL** *is.* [*fars.*] 1. Bəzi quşların başında topa şəklində tük. *Fərənin kəkili. Göyərçin kəkili.* // At və bəzi başqa heyvanların qulaqları arasından sallanan tük topası. *Qara atın kəkili; Tel-tel olub tökülü; Hər yetənə yar desən; Yar bacadan tökülü.* (Bayatı). [İlyas Adiləyə:] *Axırda ərk ilə* [atın] *kəkilindən tutub dartdım.* Ə.Məmmədxanlı.

2. Kişilərdə: alına tökülən saç. *Kəkilini üzünə tökmək. Papağın altından kəkili görünür. – Kəkilə bax, kəkilə; Kəkil üzə tökülə; Qiyamət o gün qopar; Yar gözümdən çəkilə.* (Bayatı). // Qırxılmış başın ortasında saxlanan tük topası. *Uşağın başında kəkil saxlamaq.* – [Cümrü Ağamalının] *başının ortasında kəkili olardı.* H.Sarabski.

**KƏKİLBAŞ** *sif. dan.* Başında kəkili olan; kəkilli. *Kəkilbaş oğlan.*

**KƏKİLBAZ** *is.* və *sif.* [*fars.*] Kəkil qoymağı, kəkil saxlamağı sevən adam. *Kəkilbaz oğlan.* – [Əhməd:] *Nədən ötrü məni axtarırsan, ay hiyləbaz, kəndirbaz, oyunbaz, kəkilbaz.* N.Vəzirov.

**KƏKİLCİK** *is.* Balaca kəkil, kiçik kəkil.

**KƏKİLDARAQ** *is. məh.* Şanapipik.

**KƏKKİLDƏK** *zool.* b a x **çəkçəki.** *Biçənəklərdə kəkkildəklər qaqqıldaşır.*

**KƏKİLLİ** *sif.* 1. Kəkili olan. Kəkilli fərə. – *Kəkilli durnalar hey qatar-qatar; Qaqqıldaşıb keçir, açılmış bahar.* R.Rza. ..*Kəkilli boz torağaylar hərəni öz dilində qarşılayırdılar.* M.Rzaquluzadə.

2. Başında kəkil saxlamış, kəkil qoymuş. *Kəkilli uşaq.*

**KƏKKİLTİ** *is.* Kəkliyin çıxardığı səs. *Kəkliyin kəkkiltisi eşidilirdi.*

**KƏKLİK**[1] *is.* Toyuq cinsindən əlvan tüklü çöl quşu. *Çil kəklik. Ağ kəklik. – Çoban oxur, çalır, dağlar səslənir; Nə anladır o kəkliklər turaca?* A.Şaiq. *Hava işıqlaşanda kolluqlardan bildirçin, turac, kəklik pırıldaşıb qalxdıqca* [bəylər] *alıcı quşları buraxıb ovlayırdılar.* M.Rzaquluzadə. ☐ **Kəklik kimi** – cilvəli hərəkət haqqında. *Otuzunda kəklik kimi səkərsən; İgidlik eləyib qanlar tökərsən.* "Koroğlu". *Rəqqasə də kəklik kimi süzüb gedir çəmənliyə; Hər könüldən bir səs gəlir, "ölməmişəm, sağam!" – deyə.* S.Vurğun. *Ötmə kəklik kimi min naz ilə əlvan geyinib; Bizim ətrafa da, olmazmı ki, pərvaz edəsən?* Ə.Vahid.

◊ **Kəkliyi azmaq** (əsli gəyiriyi azmaq) – b a x **gəyirik**.

**KƏKLİK**[2] b a x **kəkil.** *Bəy ..* [atın] *kəkliyini sığalladı.* M.Hüseyn.

**KƏKLİKOTU** *is. bot.* Qırmızı, bənövşəyi rəngli xırda çiçəkləri olan, gövdəsi yerlə sürünən çoxillik bitki. *Kəklikotunun al çiçəyinin, demi yarpızının ətrini gövşənə yayan xoş və təmiz səhər mehi sanki* [Nəbiyə] *qüvvət verirdi.* Ə.Abasov. [Sərvinaz qarı:] *Qaşıqla kəklikotu çayını da üstündən iç, bəlkə də tərləyəsən, ağrı-acın canından çıxa.* B.Bayramov.

**KƏKOTU** b a x **kəklikotu**. *Kəkotuların iyi hər tərəfə yayılırdı.* Ə.Vəliyev. *Bir kəkotu, bir də ağ boymadərən; Olsa, bircə gündə diriləram mən.* B.Vahabzadə.

**KƏKOV** *is. dan.* Kəkələyən adam; kəkə. *Kəkov adam. Kəkov uşaq.*

**KƏKOVLAMA** "Kəkovlamaq"dan *f.is.*

**KƏKOVLAMAQ** *dan.* b a x **kəkələmək.** *Uşaq kəkovlayır.*

**KƏKOVLUQ** *dan.* b a x **kəkəlik.**

**KƏKRƏ, KƏKRƏOTU** *is. bot.* Əsasən dəvələrin yediyi yabanı acı ot bitkisi.

**KƏL** *is.* 1. İş heyvanı kimi istifadə edilən camışın erkəyi. *Kəl arabası. – Var bu kənddə yenə elə yoxsullar; Nə cütü var, nə kotanı, nə kəli.* A.Səhhət. [Cavan oğlan] *nazik gərməşov saplı şallağını tərpədib kəlləri hayladı.* Ə.Vəliyev.

2. Əsasən dağlarda və meşələrdə yaşayan çöl heyvanı (bəzən "dağkəli" şəklində). *Kəl ovuna çıxmaq. Kəl vurmaq.*

3. *məc.* Yekə, qüvvətli, güclü, zorba adam haqqında. *Kələ oxşayır. Lap kəldir.*

**KƏLAĞAYI** *is.* Müxtəlif rəngli, haşiyəli, nazik qadın ipək baş örtüyü. *Ağ kəlağayı. Kəlağayı örtmək. – Kəlağayı əlvan, qəsəbə qıyğac; Altından cunası, hayıf ki, yoxdur.* M.P.Vaqif. *Qız Ağamehdini görən kimi başını örtdü, kəlağayısını çəkdi üzünə, çəkildi daxmanın bir bucağına.* E.Sultanov.

**KƏLAĞAYIÇILIQ** *is.* Kəlağayı toxuma sənəti.

**KƏLAĞAYILI** *sif.* Başına kəlağayı örtmüş, başında kəlağayı olan. *Kəlağayılı qız. Kəlağayılı qadın. – Elin kəlağayılı gözəl gəlini.* S.Vurğun.

**KƏLAĞAYITOXUYAN, KƏLAĞAYIÇI** *is.* Kəlağayı toxumaqla məşğul olan adam, usta.

**KƏLAM** *is.* [*ər.*] Söz. *Söz kəlam bişirər ağız kürrədə; Dəyər öz başına – dəyənək olsa...* M.Araz. // Hikmətamiz, nəsihətamiz söz (ifadə). *Füzulinin kəlamı. Ataların kəlamı.*

– *Müəllimin kəlamı; Al, saxla ehtiramı.* M.Ə.Sabir. [Qoca:] *Ellərə təsəlli verən bu kəlam Nizaminin kəlamıdır..* Ə.Məmmədxanlı. // Danışıq, söhbət. *Əvvəl taam, sonra kəlam.* (Ata. sözü).

**KƏLBƏTİN** *is.* [*ər.* kəlbəteyn – ikidişli it] Mıx və s. dartıb çıxarmaq, bir şeyi tutmaq, məftil kəsmək və s. üçün ikiağızlı maşaşəkilli metal alət. *Dülgər kəlbətini. Montyor kəlbətini.* – [Usta Həsən:] *Ay Hacı, dəllək nədir? Çağıracaqsan, gəlib bir at kəlbətinini salacaq dişinə, dartıb əngini də dişinin üstündə çəkəcək.* Ə.Haqverdiyev. *Qurd .. onu küt kəlbətin kimi sıxıb qançır etmişdi.* M.Rzaquluzadə.

◊ **Kəlbətinlə (sözü, cavabı və s.) çəkmək (qoparmaq)** – danışmağa, cavab verməyə məcbur etmək. *Xəstəxanada yatırdı, günaşırı balaca Səttarla xəstəxananın koridorlarında tibb bacılarının əl-ayağına dolaşırdıq və ağızlarından kəlbətinlə bir-iki söz qopardırdıq.* Ə.Məmmədxanlı.

**KƏLÇƏ** *is.* Camış balası. *Kəlçəni əmizdirmək.* – *Telli inək və camışı sağıb qurtardı. Kəlçə və dananı çəkib bağladı.* Ə.Vəliyev.

**KƏLƏ** *is.* 1. Cins artırmaq üçün saxlanılan axtalanmamış, burulmamış, cinslik kəl.

2. *məc. vulq.* Oynaş, aşna (kişi haqqında). *Gülöyşə bu qadına tərəf pis-pis baxıb: – Mələk olmasa, heç belə kələk olarmı? – dedi, – dalına bir o qədər kələ, buğa toplaya bilərmi?* S.Rəhimov.

**KƏLƏBƏK** b a x **kəpənək.** [Həsən Səbbah:] *Bax, doğdu günəş, güldü çiçəklər; Seyr et, nə gözəl şən kələbəklər!* H.Cavid. *Əlvan rəngə çalan dağların üstündə üzən yelkənlər ağ qanadlı kələbəklər kimi titrəyə-titrəyə gedirdi.* M.S.Ordubadi. *Qar parçaları havada ağ kələbəklər kimi uçuşur.* S.Hüseyn.

**KƏLƏÇƏ** *is. məh.* Balaca kələ.

**KƏLƏF** *is.* 1. Yumru şəkildə sarınmış sap, iplik, məftil və s.; yumaq. *Yumşaq sap kələfi. İp kələfi. Kələf sarımaq.* – [Üçüncü qız:] *Qarı nənə, yunu əyirdim. Kələfi yumaqlayıb qurtardım.* M.Dilbazi.

2. *məc.* Dolaşıq şey haqqında. [Fərhad] *fikirləşdikcə fikri uzandı və düyün düşmüş fikir kələfi açılmağa başladı.* Ə.Vəliyev. *Diksinib qaçıram; qafiyələrin dolaşıq kələfindən.* R.Rza.

◊ **Kələf dolaşmaq** – çıxılmaz, çətin, dolaşıq vəziyyət yaranmaq. [Süleyman:] *..Kələf yaman dolaşdı.* M.İbrahimov. [Camal:] *Nə xəbər verəydim, kələf elə dolaşıb ki...* S.Rəhman. **Kələf kimi (təki)** – dolaşıq, pırtlaşmış, qarışıq. **Kələfi dolaşdırmaq** – bir şeyi qarışdırmaq, dolaşdırmaq, daha çətin vəziyyətə salmaq. *Göründüyü kimi, bütün kələfi dolaşdıran ovurtdaq hesabdar cənabı idi.* S.Rəhimov. **Kələfi qarışmaq** – vəziyyəti xarablaşmaq, ağırlaşmaq, əhvalı daha da pozulmaq. *O, dörd gün belə bir qızdırma içində yatdı, beşinci gecəsi onun kələfi qarışdı, səhərə yaxın keçindi.* S.Rəhimov. **Kələfin ucu açılmaq** – bir işin səbəbi müəyyənləşmək, izi, kökü tapılmaq, məlum olmaq. **Kələfin ucunu itirmək** – pis vəziyyətə düşmək, hadisələrdən baş açmamaq, nə edəcəyini bilməmək, dolaşıb qalmaq. **Kələfin ucunu tapmaq (ələ keçirmək)** – bir işin izinə düşüb kökünü, səbəbini tapmaq, müəyyənləşdirmək. [Sərhəngə] *elə gəldi ki, müxtəlif iplərin bir-birinə ilişdiyi nöqtə, kələfin ucu əlinə keçmişdir.* M.İbrahimov. *Pristav kələfin ucunu tapmaq üçün zəmi sahibi olan Camalı həbs eləyib, strajniklərin qabağına qatdı.* Ə.Abasov. **İpək kələfinə döndərmək** – yumşaltmaq, xasiyyətini həlimləşdirmək, rəftarını yaxşılaşdırmaq.

**KƏLƏFÇƏ** *is.* 1. İp, sap dolamaq və ya dolanmış ipi sarğıdan açmaq üçün alət; sarğac, fırlanqıc. *İtirmişəm kələfçənin başını; Tapanmıram üzüyümün qaşını..* Şəhriyar.

2. Kələf.

◊ **Kələfçəsi qarışmaq** – işi çətinləşmək, dara düşmək. **Kələfçəsi pırtlaşıq (pırtlaq) düşmək** – b a x **kələfçəsi qarışmaq.** *İşi çəlpəşik olan, kələfçəsi pırtlaq düşən, dardan qurtarmaq istəyənlər .. gəlib* [Sayalını] *tapardılar.* Mir Cəlal.

**KƏLƏFLƏMƏ** "Kələfləmək"dən *f.is.*

**KƏLƏFLƏMƏK** *f.* İri və ya sapı dükçədən açıb pırtlaşmamaq üçün kələfçəyə və ya dizə dolamaq, kələf şəklinə salmaq; yumaqlamaq.

**KƏLƏFLƏNMƏ** "Kələflənmək"dən *f.is.*

**KƏLƏFLƏNMƏK** *məch.* Kələfçəyə və ya dizə dolanaraq kələf şəklinə salınmaq; yumaqlanmaq.

**KƏLƏK** *is.* Hiylə, fırıldaq, badalaq, biclik, fənd, aldatma. *Kələk ilə gələn külək ilə gedər.* (Ata. sözü). [Süleyman:] *Öyrən bu kələyi, arvadı tap, tez toy elə!* Ü.Hacıbəyov. [Mustafa bəy:] *Mirzə Kərim, bunlar hamısı sənin kələyindir.* Ə.Haqverdiyev.

◊ **Kələk gəlmək** – yalan sözlərlə, hiylə ilə aldatmaq, fırıldaq işlətmək. [Nəbi:] *Mehdinin əlindən dad edər fələk; Naçalniklər mənə gəlirlər kələk.* "Qaçaq Nəbi". [Salamov:] *Adə, .. sən də mənə kələk gəlirsən?* C.Cabbarlı. **Kələk işlətmək** – b a x **kələk gəlmək.** [Hacı Mehdi:] *Hər nə kələyin var, işlət.* Ə.Haqverdiyev. *Molla Qasım anladı ki, belə camaatın içində hər nə ki, kələyi varsa, işlədə biləcəkdir.* S.S.Axundov. **Kələk qurmaq** – biclik işlətmək, hiylə düzəltmək. *Lakin o yerlərdə gedir, durmayır; Bir elə layiqli kələk qurmayır.* M.Ə.Sabir. [Cahan:] *Bizə də sən qur kələk, sən qur kələk, sən qur kələk.* Ü.Hacıbəyov. [Hacı Fərəc:] *Ziynət xanımı görmək üçün nə kələk qurdumsa, zalım qızı elə dəlillər gətirdi ki, qaldım məəttəl.* N.Vəzirov. **Kələyə düşmək** – tora düşmək, hiyləyə aldanmaq, işə düşmək. [Hacı Murad:] *Seyidin kələyinə düşüb cəmi dövlətini məscidə vəqf etmişdir.* S.S.Axundov. *Əcəb kələyə düşdük, əcəb qaldıq xatada.* S.Rüstəm. **Kələyə salmaq (qoymaq)** – cəncəl işə salmaq. [Gülçöhrə:] *Əsgər bizi kələyə qoyub, sənin acığına və mənim əzabıma səbəb oldu.* Ü.Hacıbəyov. **Kələyi baş tutmamaq** – hiyləsi həyata keçməmək, boşa çıxmaq. [Məşədi İbad:] *Lotular pul söhbətini eşidib qaçdılar. Yox, mənim kələyim baş tutmadı.* Ü.Hacıbəyov. **Kələyi kəsilmək** – üzülmək, əldən düşmək. **Kələyini kəsmək** – son dərəcə yormaq, incitmək, əldən salmaq, çox əziyyət vermək, üzmək. *Yol kələyimizi kəsdi.* – [Əhmədov:] *Çadırdan, brezentdən tap, yoxsa bu gün bizim kələyimizi kəsər.* Mir Cəlal. **Kələyinin üstü açılmaq** – hiyləsi, bicliyi, fırıldağı aşkara çıxmaq, bəlli olmaq, baş tutmamaq. [Əsgər:] *Zərər yoxdur, bir-iki saatdan sonra mənim kələyimin üstü açılar, onda qız da sevinər, mən də sevinərəm.* Ü.Hacıbəyov.

**KƏLƏKBAZ** *sif.* 1. Hiyləgər, bic, fəndgir, fırıldaqçı. *Qış dolanar, yaz olar; Göldə ördək, qaz olar; Hər nə desən qıza de; Gəlin kələkbaz olar.* (Bayatı). [Qarı Haşimiyə:] *İndi ki* [Məcnun] *kələkbaz kor kimi bizim obaya gəlir, sən də hiyləyə hiylə ilə müqabilə et, oğlum!* Ə.Məmmədxanlı. // Zarafatla işlədilir. *Ay kələkbaz!* – [Əsgər:] *Halal olsun Süleyman; Sən nə kələkbazsan, şeytan!* Ü.Hacıbəyov.

2. Zarafatçı, masqaraçı, məzəli adam haqqında.

**KƏLƏKBAZLIQ** *is.* Biclik. Hiyləgərlik, fəndgirlik. *Üzündən kələkbazlıq tökülür.* – *Ən nəhayət, çıxılmaz vəziyyət Sərvəri kələkbazlığa məcbur edir.* Ə. Sultanlı.

**KƏLƏKÇİ** *is.* Kələkbaz.

**KƏLƏKÇİLİK** *is.* Kələkbazlıq.

**KƏLƏKƏ** *is. məh.* Yeni doğmuş heyvanın ağuz südünün bişmişi.

**KƏLƏKLƏMƏ** "Kələkləmək"dən *f.is.*

**KƏLƏKLƏMƏK** *f. dan.* Kələk gəlmək, aldatmaq. [Məşədi İbad:] *Görüm hamamçını bir növ kələkləyə bilərəmmi?* Ü.Hacıbəyov.

**KƏLƏ-KÖTÜR** *sif.* 1. Üstü hamar olmayan, nahamar; girintili-çıxıntılı (səth haqqında). *Kələ-kötür divar. Kələ-kötür daş.* – *İri kələ-kötür ətəkləri qaratikan kolları ilə döşənmiş dağlar arasında yuxarı qalxdıqca təbiət və hava bütün başqalaşır.* A.Şaiq. *..Qayıq fənər işığında aydın görünən boz, kələ-kötür qayaların üç-dörd addımlığında idi.* M.Hüseyn.

2. Qaba, kobud, yöndəmsiz, yaraşıqsız, biçimsiz. *Kələ-kötür əl.* – *Dəmirçioğlu baxdı ki,* [Koroğlu] *bir yekəpər, kələ-kötür adamdı, üz-gözündən zəhm yağır.* "Koroğlu". *O barmaqların hamısı, bir-birinə oxşayan kələ-kötür barmaqlardır.* M.S.Ordubadi. // Düzgün olmayan, əyri-üyrü, biçimsiz. *Kələ-kötür hərflər və əyri xətlərlə adi şagird dəftərinin dörd vərəqini tutan bu kağız imzasız idi.* M.İbrahimov. *Bir də ki, kələ-kötür xətlə yazılmış sözləri oxuyub, xeyir xəbər olduğunu gördüm.* H.Seyidbəyli.

3. *məc.* İncəlikdən məhrum; qaba, kobud. [Kərəmov:] *Axır zamanlar bir az sən də kələ-kötür* (z.) *danışmağa başlamısan.* S.Rəhman.

4. *məc.* Əzablı, əziyyətlə dolu, ağır, əziyyətli. [Firidun] *ömrünün kələ-kötür və tikanlı keçmişini deyil, min bir xəyal və ümidlə dolu gələcəyini düşünürdü.* M.İbrahimov.

**KƏLƏ-KÖTÜRLƏŞDİRMƏ** "Kələ-kötürləşdirmək"dən *f.is.*

**KƏLƏ-KÖTÜRLƏŞDİRMƏK** *f.* 1. Kələ-kötür etmək.

2. *məc.* Qabalaşdırmaq, kobudlaşdırmaq.

**KƏLƏ-KÖTÜRLƏŞMƏ** "Kələ-kötürləşmək"dən *f.is.*

**KƏLƏ-KÖTÜRLƏŞMƏK** *f.* 1. Kələ-kötür olmaq.

2. *məc.* Qabalaşmaq, kobudlaşmaq.

**KƏLƏ-KÖTÜRLÜK** *is.* Kələ-kötür şeyin hal və vəziyyəti. *Yolun kələ-kötürlüyü. Xəttin kələ-kötürlüyü.*

**KƏLƏKSİZ** 1. *sif.* Hiyləsiz, düz.

2. *zərf* Kələk işlətmədən, kələk qurmadan.

**KƏLƏM** *is.* Yarpaqları xörəyə işlənən bostan bitkisi. *Bir baş kələm. Kələm dərmək. – Bazara turp, kök, kələm, soğan gələr satılmağa; Küləkli qar, yağış yağar uzun-uzadı yaylağa.* A.Səhhət. ☐ **Baş kələm** *bot.* – kələmin iri yarpaqlar şəklində açılan növü. *2 kq baş kələm almaq.* **Daş kələm** *bot.* – xörəyə işlənən yoğungövdəli kələm növü. **Dəniz kələmi** *bot.* – xörəyə qatılan və müalicə məqsədi ilə işlədilən dəniz yosunu. *Dəniz kələmi konservi.* **Gül kələm** *bot.* – gül şəklində olan kələm növü. *Gül kələmi doğramaq.* // Həmin tərəvəzdən hazırlanmış xörək. *Kələm şorbası.*

◊ **Kələm suyu** – borşa zarafatla verilən ad. *Canım, Allahın kələm suyu – borşu istəyirsən, içindən sosiska çıxır.* S.S.Axundov.

**KƏLƏMAT** [*ər.* kəlimat – "kəlmə" söz cəmi] Kəlmələr, sözlər. *Oxunur məclisdə xoş kəlamatı; Ox kimi bağrını dələr, ağlarsan.* M.V.Vidadi. [Müsyö Jordan:] *İndi də mənim ilə durub-oturmaqdan bir para kələmatı hifz edibdir.* M.F.Axundzadə.

**KƏLƏMBAŞ** *sif. dan.* Girdə, yekə başı olan (adam haqqında). *Kələmbaş adam.*

**KƏLƏMDOLMALIQ** *sif.* və *is.* Kələmdolması bişirməyə yarar yarpaqları olan baş kələm. *Kələmdolmalıq kələm.*

**KƏLƏMDOLMASI** *is.* Kələm yarpaqlarına bükülmüş, döyülmüş ət və s.-dən hazırlanan xörək. *Kələmdolması bişirmək. – Bu beş ilin müddətində "Nicat" xüsusunda bu tərifləri eşidəndən sonra bir neçə kələmdolması yeyib bərk yuxuya getdim..* C.Məmmədquluzadə. [Qurban:] *Niyaz axşam bizə gəl, səni bir yaxşı kələmdolmasına qonaq eləyim.* Ə.Haqverdiyev. *..Tükəzban əvvəlcə nəvəsinin, sonra da gəlininin boşqabına kələmdolması çəkdi.* M.Hüseyn.

**KƏLƏMQURDU** *is. zool.* Kələmə ziyan verən və onun içində olan həşərat (qurd, cücü).

**KƏLƏMLİK** *is.* Kələm əkilmiş yer. *Kələmliyi sulamaq.*

**KƏLƏNTƏR** *is. qəd.* Şəhərin inzibati işlərinə baxan vəzifəli şəxs. [Bazarbaşı:] *Hacı ağanın qədrini bilməyənlər də vardır, .. məsələn, bizim kələntər.* P.Makulu.

**KƏLƏNTƏRLİK** *is. tar.* 1. Kələntərin vəzifəsi, işi.

2. Kələntərin idarəsi altında olan ərazi.

**KƏLƏZ** *is. zool.* Sürünənlər sinfinə aid olan, daşlıq və qayalıq yerlərdə yaşayan iri kərtənkələ növü. *Kələz ilən, əqrəb ilən, mar ilən; Ağzınadək qəbrin dolar, ağlarsan.* M.V.Vidadi.

**KƏLİK** *is.* [*fars.*] Dəyməmiş, yetişməmiş, kal qovun, yemiş. *Bostançının sovqatı kəlik olar.* (Ata. sözü). // Qovunun, yemişin qabığı yaşımtıl, əti isə bərk olan növü. *Uşağın qucağına üç-dörd kəlik verib evə göndərdim..* Ə.Vəliyev.

**KƏLİSA** b a x **kilsə.** *Harda olsan, dövlətididarın olsun cilvəgər; Arifə məqsəd nə məscid, nə kəlisadır, qərəz.* S.Ə.Şirvani. *Dəstəmaz eylədiyin çeşmə müsəlman qanıdır; Bilmirəm hansı kəlisada namaz eyləmisən.* Şəhriyar.

**KƏLLAHI** *sif.* və *zərf dan.* Özbaşına, azad, sərbəst, özü istədiyi kimi. *Kəllahı adam. Kəllahı dolanmaq. – Adam var, çölləri gəzər kəllahı; Adam var, tanımaz gözəl Allahı.* "Abbas və Gülgəz".

**KƏLLƏ** *is.* [*fars.*] 1. Baş. *Kəlləsindən vurmaq. – Ox atma sən bu daşa; Bu qayaya, bu daşa; Düşməni elə vur ki; Kəlləsindən bud aşa.* (Bayatı). *Misri qılınc kəllələri kəsəndə; Bağırsaqlar cəmdəklərə dolana.* "Koroğlu". **Kəllə vurmaq** – başı ilə vurmaq. *Qurd atıldı meydana; Vuruşdular doyunca; Keçi kəllə vurunca; Qurd bulaşdı al-qana.* M.Müşfiq. // Başın təpə hissəsi, ortası. *İşıqda kəlləsi parıldayırdı.*

2. Əti çürüyüb tökülmüş baş sümüyü; qafa tası; qafa. *Skeletin kəlləsi. Mamontun kəlləsi.* – [Xəyyam:] *Bir böyük quş qonaraq bürcünə gördüm Tusun; Süzərək kəlləsini pəncədə Keykavusun.* H.Cavid. [Həyat:] *Sən lap filosof olmusan. Hamlet kimi çürümüş kəllələrlə danışmaq istəyirsən.* M.İbrahimov. ☐ **Kəllə qutusu** – b a x **qafa tası (**“**qafa**”da**)**.

3. B a x **kəlləpaça**. *Kəllə bişirmək. Kəllə yemək.*

4. Bir şeyin ən yuxarı hissəsi, təpəsi; zirvə. *Divarın kəlləsi. Ağacın kəlləsi. – Ay getgedə qarşıdakı uca dağın kəlləsinə sancılıb gizlənməyə başlayırdı.* H.Nəzərli. [Rüstəmin] *gözləri qabağında .. Qəhrəmanın quşqonmaz ağacların kəlləsinə çıxmağı canlandı.* S.Rəhimov.

5. *məc. dan.* Ağıl, kamal, şüur mənasında. *Kəlləsi yoxdur. Kəlləsi işləmir.* // *məc. dan.* Çox ağıllı, başlı adam haqqında. *Yaman kəllədir.*

6. Konus və ya yuvarlaq şəkildə istehsal olunan şey. *İki kəllə pendir.* – [Sultan bəy:] *Elə hamı mən deyəni deyir: bir hallıca-bolluca dul arvad ola ki, bir nəfər molla, üç manat pul və bir kəllə qənd ilə iş tamam ola.* Ü.Hacıbəyov. [Cavad:] *O günlər Məşədi Babanın qızının kəbini kəsiləndə iki xalvar buğda, .. bir kəllə qənd və bir girvənkə çay gətirmişdilər.* B.Talıblı.

7. *sif. mənasında.* Baş, başda olan; kənar. *Kəllə pəncərə.* – [Nuriyyə:] *Qərənfil bacı məni pəncərələri qərbə baxan kəllə otağa apardı.* İ.Əfəndiyev. *Eyvanın kəllə sütununun qabağında qoyulmuş bədənnüma güzgünün qabağında Ağazal özünə axırıncı sığalı da verdi.* Ə.Əbülhəsən. *Həyatinə sal daşı döşənmiş ev iki kəllə, bir orta otaqdan ibarətdir.* Ə.Vəliyev.

8. *məc. dan.* Kobud, qaba, kimsəyə boyun əyməyən adam haqqında. *Kəllə uşaq. Çox kəllədir. Kəllə* (z.) *danışır.*

9. B a x **zenit** 1-ci mənada. *Avqust günəşi düz kəllədə idi.* Ə.Əbülhəsən.

◊ **Kəllə-kəlləyə gəlmək (durmaq)** – üzüzə gəlmək, döyüşmək, vuruşmaq, toqquşmaq. *Tanklar qabaqlaşdı. Elə bil, iki qoç kəllə-kəlləyə gəldi.* Ə.Vəliyev. // *məc.* Mübarizə aparmaq. *Zəngəzur naçalniki Səlim bəylə kəllə-kəlləyə gələn, .. adı dillər əzbəri həmin igid Həcəri deyirəm!* S.Rəhimov. [Fərman] *hər gün öz maşınına əyləşərək dağlarla kəllə-kəlləyə gəlirdi.* Ə.Sadıq. **Kəlləni ağartmaq** – b a x **kəlləni yerə qoymaq (atmaq)** 2-ci mənada. **Kəlləni yastığa atmaq (qoymaq)** – b a x **kəlləni yerə qoymaq (atmaq)** 1-ci mənada. *At kəlləni yastığına, yaxşı uzan, yaxşı yat; Mən dinsəm də, dinməsəm də, keçinəcək bu həyat.* S.Vurğun. **Kəlləni yerə qoymaq (atmaq)** – 1) yıxılıb yatmaq, yuxulamaq; 2) *məc.* ölmək. *Baxış bəy: – Dava nədir, ay pristav, – dedi, – alnına gülləni vurarlar, kəlləni birdəfəlik qoyarsan yerə.* Ə.Abasov. **Gözü (gözləri) kəlləsinə çıxmaq** – b a x **göz**. *Axundun gözləri çıxır kəlləsinə.* “M.N.lətif”. [Mərdan:] *..Yoxsa səni o qədər boğaram ki, gözlərin çıxar kəllənə dana gözləri kimi.* N.Vəzirov.

**KƏLLƏBƏKƏLLƏ**: **kəlləbəkəllə gəlmək** – b a x **kəllə-kəlləyə gəlmək (durmaq) (**“**kəllə**”də**)**.

**KƏLLƏÇARX** *is.* [*fars.*] Neft buruqlarının və qüllə şəkilli başqa qurğuların təpəsində olan qaldırıcı çarx. *Dolamaçarxın kəlləçarxı. – Vışkaların təpəsində fırlanan kəlləçarxların cırıltısı eşidilmirdi.* M.S.Ordubadi. *Buruqların şam ağacı kimi səmaya yüksəlməsi, başlarında qurulmuş kəlləçarxın fır-fır fırlanıb quyulardan neft dartması .. əzəmət təşkil edirdi.* B.Talıblı.

◊ **Kəlləçarxa vurmaq** – bir iş və ya hərəkətdə son həddə, ifrat dərəcəyə varmaq; həddini aşmaq. [Mirzə Cəlil:] [Ataş] *özbaşına qalsa, kəlləçarxa vurar, yatan itləri də oyadar.* Ə.Vəliyev.

**KƏLLƏÇARXÇI** *is. dan.* 1. Kəlləçarxda işləyən fəhlə.

2. Çox yüksəklərdə işləməyi bacaran fəhlə, usta.

**KƏLLƏGÖZ** *sif.* 1. Nağıllarda: gözü kəlləsində olan (canlı); təpəgöz. *Qəhrəman altıayaq, kəlləgöz atını sürüb, İbrahimi də aldı tərkinə.* (Nağıl).

2. *məc.* Hirsli, tez qızışan, qəzəbli. [Şiraslan:] *Bir az belə, bir təhər adamdır, kəlləgözdür..* M.Süleymanov.

**KƏLLƏGÖZLÜK** *is. dan.* Tez hirslənən, tez qızışan adamın xasiyyəti; hirslilik.

**KƏLLƏLƏMƏ** "Kəlləmək"dən *f.is.*

**KƏLLƏLƏMƏK** *f.* 1. Kəllə ilə döyüşmək, kəllə ilə vurmaq. *Qoçlar bir-birini kəllələdilər.*

2. *məc.* Qəsdən incitmək.

**KƏLLƏLƏŞMƏ** "Kəlləşmək"dən *f.is.*

**KƏLLƏLƏŞMƏK** 1. *qarş.* Kəllə ilə vuruşmaq, kəllə ilə döyüşmək. *Qoçlar kəlləşdi.*

2. B a x **kəllələmək** 2-ci mənada.

**KƏLLƏLİ** *sif. dan. zar.* Başlı, ağıllı.

**KƏLLƏLİK** *is.* 1. Çərçivənin üst uclarını birləşdirən gödək ağac. *Kəlləlik kəsmək. Kəllәlik düzəltmək.*

2. Bir şeyin kəllə (üst) tərəfini təşkil edən hissəsi.

3. *məc.* Tərslik, yekəbaşlıq. *Kəllәlik* (z.) *etmək. Kəllәlik* (z.) *göstərmək.*

4. *məh.* Qapının üstündə olan pəncərə.

**KƏLLƏMAYALLAQ** *zərf* 1. Başı aşağı, ayaqları yuxarı halda. *Kəlləmayallaq yıxıldım. Kəlləmayallaq olmaq. – Ola bilər ki, .. kəlləmayallaq divarın üstündən yıxılıb düşə.* C.Məmmədquluzadə. **Kəlləmayallaq aşmaq (gəlmək)** – başıaşağı uçmaq, yıxılmaq, enmək. [Yarməmməd Naznaza:] *Yapışdım iki qıçından, şalban kimi kəlləmayallaq aşdı.* M.İbrahimov. [Şofer:] *Tüfəng açıldı. Özüm də təpmənin şiddətindən kəlləmayallaq qayığın dibinə aşdım.* M.Rzaquluzadə. // Tərsinə, başıaşağı. *Stulları kəlləmayallaq qoymaq.*

**KƏLLƏPAÇA** *is.* [*fars.*] 1. Kəsilmiş qoyun və ya keçinin başı və ayaqları. *Kəlləpaça bişirmək. Kəlləpaça almaq. – Qazı durdu ayağa, ocağı yandırdı, kəlləpaçanı saldı çölməyə.* (Nağıl).

2. *aşp.* Qoyun və ya keçinin kəlləsi və ayaqlarından bişirilən duru xörək; baş-ayaq. *Sirkə-sarımsağını hesab edən kəlləpaça yeməz.* (Ata. sözü). [Zərbəli:] *Yaxşı lətif piti var, küftəbozbaş, kəlləpaça var, kotlet var.* Ə.Haqverdiyev.

**KƏLLƏPƏZ** *is.* [*fars.*] *köhn.* 1. Kəlləpaça bişirib satan adam. *Səfər günü Xəlil əmisi kəlləpəz İmanı gətirib, evlərinə hayan qoyub, anası və bacısı ilə ağlaya-ağlaya vida etdi.* Ə.Haqverdiyev.

2. Kəlləpaça bişirilib satılan dükan və s. *Bura sərraf dükanı deyil, kəlləpəz dükanıdır.* "M.N.lətif".

**KƏLLƏPƏZLİK** *is. köhn.* Kəlləpaça bişirmə sənəti.

**KƏLMƏ** *is.* [*ər.*] 1. Söz. *Qurban mollanın ağzından çıxan kəlmələri yeyəcəkmiş kimi .. onu dinləyirdi.* A.Şaiq. [Səfərəli:] *Bizim İstanbulda böylə kəlmələr işlənməz.* H.Nəzərli. [Fərman müəlliminin] *..dediklərini mənimsər və rusca hələ zəif bilməsinə baxmayaraq, kəlmələri bir-birinə quraşdıraraq sualı sual dalınca verərdi.* Ə.Sadıq. □ **Kəlmə(si)-kəlməsinə** – b a x **kəlməbəkəlmə**. *Kəlmə-kəlməsinə xəbər vermək.* // İfadə, ibarə.

2. Saylarla: bir, iki, üç və i. a. kəlmə – bir neçə söz, az söz, qısaca. *Mehriban iki kəlmə ilə yenə içə bilməyəcəyini və içmək istəmədiyini bildirdi.* S.Hüseyn. [Qəhrəman:] *Bu iki gündə nə ev sahibi xanım ilə, nə də qulluqçu ilə bir kəlmə danışmaq ehtiyacımız olmadı.* H.Nəzərli. [Xalıq:] *Bəli, mənəm, dayan, səninlə iki kəlmə sözüm var.* S.Rəhman.

3. Kəlmə və ya kəlmeyi-şəhadət *din.* – müsəlmanlığın əsas rəmzi olan "lailahə illəllah, Məhəmmədün-rəsullüllah" ifadəsi (islam dininə görə hər bir müsəlman yatmazdan qabaq və ya ölərkən və yaxud başqa hallarda bu ibarəni söyləməklə müsəlman olduğunu göstərir). *Sirat, sual qabaqdadı, nə damaqdı dünyada; Kəlmeyi-şəhadət lazımdı ölən vaxtı dünyada.* Aşıq Ələsgər. [Arvad:] *Ay kişi, ..səni görüm öləndə dilin kəlməyə gəlməsin, sən bəyəm qoyursan ki, mən bilim nə iş görürəm?* H.Sarabski.

◊ **Kəlmeyi-şəhadətini demək (oxumaq, söyləmək, yada salmaq, dilinə gətirmək)** – ölümünü gözü qabağına almaq, ölməyə hazırlaşmaq. *Uzaqdan diqqət edirsən ki, görüm, əgər* [atlıların] *başında papaq var, kəlmeyi-şəhadətimi oxuyum.* C.Məmmədquluzadə. *Bu sözləri xatırına gətirib Molla Tanrıverdi başladı .. kəlmeyi-şəhadətini oxumağa.* E.Sultanov. **Kəlmə kəsmək** – danışmaq. *Maral bir daha Cuma ilə kəlmə kəsməyib getdi.* Ə.Əbülhəsən. *Hesabını başa düşən Qarakişi daha bir kəlmə də kəsmədi.* B.Bayramov. [Rəşid:] *..Ancaq ömrümdə görməmişdim ki, Qara Canbalayev, ya da Gövhər xanım mənimlə kəlmə kəssin.* İ.Hüseynov. **Kəlmə verib kəlmə almaq** – b a x **kəlmə kəsmək.** [Qoca qarı:] *Mən gəlin gedəndə*

*ondan da kiçik idim, qaynanamla kəlmə verib kəlmə alanda üzüm qızarardı.* Qantəmir.

**kəlmə-kəlmə** *zərf* Ayrı-ayrı sözlərlə, hər sözü ayrıca. *Kəlmə-kəlmə tərcümə etmək. Kəlmə-kəlmə diktə etmək. – Əzizim, kəlmə-kəlmə; Sözü de kəlmə-kəlmə; Oturaq xəlvət evdə; Danışaq kəlmə-kəlmə.* (Bayatı). *"Əlif"in hökmüylə, "cim" fərmanıyla; Ara kəlmə-kəlmə, dağıt "əmmə"ni.* Aşıq Ələsgər.

**KƏLMƏBAŞI** *zərf* Hər sözün başında; tez-tez. *Dırnaqları manikürlü, dodaqları qırmızı; Kəlməbaşı deyir ki: "Mən el qızıyam, el qızı".* S.Rüstəm. *Ya mənim ingiliscəm; tərcüməyə möhtacdır; ya o, keydir; Elə "ay si" deyir; "Yes" deyir; kəlməbaşı "okey" deyir.* R.Rza.

**KƏLMƏBƏKƏLMƏ** *zərf* Bir-bir, kəlmələrlə, sözbəsöz. *Kəlməbəkəlmə oxumaq. Kəlməbəkəlmə yazmaq.*

**KƏLMƏCİK** "Kəlmə"dən *kiç.*

**KƏLMƏLİK** *sif.* Saylarla işlənib sözün miqdarını bildirir. *Səməd səbr edə bilməyib bir neçə kəlməlik məktub yazdı.* İ.Hüseynov. *..Bəlkə həyatla ölüm haqqında; üç kəlməlik bir əfsanə dedi.* R.Rza.

**KƏLTƏN** *is. məh.* İri kəsək. *Dişli malalar iri kəltənləri əzib xırdalayır. – Əkbər kəltəni.. Məşədi Hüseynin kəlləsinə çırpmaq istəyəndə Müslüm qoymadı.* Mir Cəlal.

**KƏLTƏNLİ** *sif. məh.* Kəltəni olan; kəsəkli. *Kəltənli yer. Kəltənli tarla.*

**KƏM**[1] *sif.* və *zərf* [*fars.*] 1. Az. *Yağış yağdı, nəm qaldı; Qəlyan keçdi, dəm qaldı; Bağçada bar bol idi; Dolu vurdu, kəm qaldı.* (Bayatı). [Usta Kərbəlayıya:] *Etiqadın kamildir, ruzin kəm!* Çəmənzəminli. ☐ **Kəm etmək (qılmaq)** *köhn.* – azaltmaq, əskiltmək, əskik etmək. *Ol ləhzə həm etmə şəfqətin kəm.* Füzuli. **Kəm gəlmək** – əskik olmaq, əskik gəlmək, çatmamaq. *Onda kəm gələn qızılı Ələmdar bu uğultulu şəhərin harasından tapa bilərdi?* S.Rəhimov. **Kəm olmaq** – azalmaq, çatışmamaq, kifayət etməmək. // Əskik olmaq. *Evlər yıxan ola daneyi-xalı; Bir dəm kəm olmaya məndən xəyalı.* Qurbani. [Sayalı:] *İltifatın kəm olmasın!* Mir Cəlal.

2. Nöqsanlı, az, çatışmayan. *Aşıq deyər Əlidən; Sözün başlar bəlidən; Ağlı kəm canana bax; Küsübdür mən dəlidən.* (Bayatı). *Ağıldan kəm, huşdan çaşqın, dil qanmaz; Şərm etməz qonaqdan, ölməz, usanmaz.* Aşıq Ələsgər. // Alçaq, rəzil, yaramaz, pis. *Var mərdə qul ol, aşıq; Kərəm umma kəm ərdən.* Sarı Aşıq.

3. *məc.* Pis, qaba, kobud, xoşagəlməz. *Qəzəblənmiş sərkar Alagözü təzəcə yanan lampa işığında başdan-ayağa süzüb: – Sən çox kəm danışırsan, xanım!* A.Şaiq.

4. Aşağı, əskik. *Key nəşeyi-eşqdən vuran dəm! Məcnunu sağınma Leylidən kəm!* Füzuli. *Mənim yarım deyil ol Kəbədən kəm.* M.P.Vaqif.

◊ **Kəm baxmaq** – pis nəzərlə baxmaq, əyri baxmaq, kəc baxmaq. *Mən fələkə neylədim; Fələk mənə baxdı kəm?* H.K.Sanılı. *Mən yazığın yenə yatıbdır baxtı; Kəm baxdı dostuna, evini yıxdı.* Aşıq Hüseyn. *Ona görə bu dostluğu kəsmişəm; Kəm baxırsan üzbəüzə gələndə.* Aşıq Əziz. **Kəm tutmaq** – saymamaq, etinasızlıq göstərmək. *Tutma kəm, kim çox kərəmdir həm əzimü-şan sənə; Fəxr qıl, kim padişahlardan gəlir paşaya kürk.* M.P.Vaqif. **Qəmin kəm** – "eybi yoxdur, fikir eləmə, düzələr", yaxud "bəxtindir" mənalarında. [Əlibaba:] *Axtar, naçənnik, taparsan, qəmin kəm.* H.Seyidbəyli.

**KƏM**[2] *is.* Yüyənin atın ağzına keçirilən dəmir hissəsi; cövzə. *Atın kəmini tutmayan yolda piyada qalar.* (Ata. sözü).

**kəm...** [*fars.*[. Mürəkkəb sözlərin azlıq mənasında olan birinci tərkib hissəsi; məs.: kəmsavad, kəmetina, kəmağıl və s.

**KƏMAĞIL** *sif.* [*fars.* kəm və *ər.* əql] Ağlı az, ağıldan zəif. *Kəmağıl adam.*

**KƏMAĞILLIQ** *is.* Ağıl azlığı, ağlı çatışmazlıq; giclik. *Kəmağıllıq etmək.*

**KƏMAL** b a x **kamal.** *Yəni ki, gətir kəmalə zövqüm; Gündən-günə qıl ziyadə şövqüm.* Füzuli. *Hər aşiqin ki, sən kimi bir məhcəmalı yox; Nöqsanı var ki, eşqinə əsla kəmalı yox.* S.Ə.Şirvani. *Elə bil ağladın, canım dağladın; İtirdim kəmalım sən ağlayanda.* Molla Cümə. // *kit.* Bir sıra izafət tərkiblərində təyin etdiyi şeyin təkmilliyini, bitkinliyini, tamlığını, çoxluğunu bildirir, məs.: **kəmali-diqqətlə** – tam diqqətlə, son dərəcə diqqət yetirilərək; **kəmali-qayda ilə** – qaydasınca, tamamilə. **kəmali-qeyrətlə** – çox

qeyrət göstərilərək, çox çalışaraq; – *Kəblə Novruzqulu kəmali-qayda ilə palçığa oturur.* H.Sarabski.

**KƏMALINCA** bax **kamalınca.**

**KƏMAN** bax **kaman.** *Kəmanə dönübdü qaməti-mövzun; Əhvalını fələk edib digərgun.* Q.Zakir. *Ey alnın ay, üzün günəş, ey qaşların kəman; Ceyran gözün, qarışqa xətin, kakilin ilan.* M.Ə.Sabir.

**KƏMANDAR** bax **kamandar**. *Nə kəmandarsan, ey məh ki, atıb qəmzə oxun; Yıxdığın seyddə nə zəxm, nə peykan görünür.* Füzuli.

**KƏMBAHA** *sif.* [*fars.*] *köhn.* Ucuz, qiymətsiz, dəyəri az. *Kəmbaha paltar.*

**KƏMBƏXT** *sif.* [*fars.*] Bəxtsiz, talesiz.

**KƏMBƏXTLİK** *is.* Bəxtsizlik, talesizlik.

**KƏMCÜRƏT** *sif.* [*fars.* kəm və *ər.* cürət] Az cürətli (cəsarətli), cürətsiz, cəsarətsiz, qorxaq. – *Gözəlin bəzisi bədniyyət olur; Qədrbilməz olur, bihürmət olur; O ki bir parası kəmcürət olur; Çətin ələ düşər dilavər gözəl.* Q.Zakir. *..Bizim tüccarlar mərhum Mirzə Fətəlinin Hacı Qarası kimi aciz, qorxaq və kəmcürət olur*(*lar*).. F.Köçərli. // İs. mənasında. *Cürətli şəhər alar; Kəmcürət küncdə qalar.* (Ata. sözü). [Seyid:] *Pah, oğlan, bəs sən belə kəmcürətmişsən? Mən səni belə bilmirdim...* E.Sultanov.

**KƏMCÜRƏTLİLİK** *is.* Cürət, cəsarət azlığı; cürətsizlik, cəsarətsizlik, qorxaqlıq. *Burada kəmcürətliliyimiz aşkara çıxır.* C.Məmmədquluzadə.

**KƏMÇƏ** *is.* [*fars.*] bax **malakeş** 2-ci mənada.

**KƏMÇƏNƏ** *sif. məh.* Alt çənəsi gödək. *Kəmçənə quzu.*

**KƏMÇİK** 1. *is.* Çatışmayan hissə, parça, şey.

2. *sif.* Tam olmayan, yarımçıq. *Kəmçik ay. Kəmçik parça* (ağız-ağıza qatladıqda kənarları bir-birinə düz gəlməyən parça).

**KƏMETİBAR** *sif.* [*fars.* kəm və *ər.* etibar] Etibarsız, etibarı az olan, etibarı olmayan, etibar edilə bilməyən. *Kəmetibar adam.*

**KƏMETİQAD** *sif.* [*fars.* kəm və *ər.* etiqad] *klas.* Etiqadı olmayan, etiqadı az olan; etiqadsız.

**KƏMETİQADLIQ** *is.* Etiqadı az olma; etiqadsızlıq.

**KƏMETİNA** *sif.* [*fars.* kəm və *ər.* etina] Etinasız, diqqətsiz. *Həmişə kəmetina Zeynal bu gecə hər şeyə diqqət ilə baxıb, hər bir hənirtiyə məna verməyə başladı.* Çəmənzəminli. *Müavini kəmetina vəziyyətini pozmayaraq əyləşdi.* B.Bayramov.

**KƏMETİNALIQ** *is.* Etinasızlıq, diqqətsizlik. *Zeynəb də Nadirin kəmetinalığını gördükdə sakit oturub, gözlərini qırpmayaraq otağın bucağında asılmış tüfəngin çaxmağına baxırdı.* B.Talıblı. *Bu nazənin gözəlin yaxşı dilgüşalığı var; Heyif, öz aşiqinə çox kəmetinalığı var.* Ə.Vahid. ☐ Kəmetinalıq etmək (göstərmək) – etinasızlıq göstərmək. *Hətta arvadlar da kəmetinalıq etməyib, darvazaların arasından kərbəlayıya təhqiqlə nəzər yetirirdilər.* Çəmənzəminli.

**KƏMƏDƏB** *sif.* [*fars.* kəm və *ər.* ədəb] *köhn.* Ədəbsiz, biədəb. *Kəmədəb uşaq.*

**KƏMƏDƏBLİK** *is.* Ədəbsizlik, tərbiyəsizlik, biədəblik.

**KƏMƏND** *is.* 1. Qədim müharibələrdə düşməni tutmaq üçün uzaqdan atılan ucilməkli uzun ip. [Dəmirçioğlu] *axırda belindən kəməndini açıb, qayaya atdı.* "Koroğlu". // Ovda heyvanı və ya xam atı tutmaq üçün işlədilən həmin ip. [Dərviş:] *Bir dəfə xam at tuturduq, at Ruqiyyənin yanından keçən zaman Ruqiyyənin əlindən kəmənd çıxdı.* A.Divanbəyoğlu. *Beyrək qulaylanıb kəməndi atdı.* M.Rzaquluzadə. // İlmək, bağ, düyün. ☐ **Kəməndə düşmək** – 1) kəməndlə tutulmaq (at və s. haqqında). *Göy ürkəyə kəmənd atdılar. At kəməndə düşdü.* Ə.Vəliyev; 2) *məc.* tora düşmək.

2. *klas.* Şairanə təşbehlərdə gözəlin saçına, zülfünə işarə. *O tari-zülfə əsirəm, şikayətim çoxdur; Özüm kəməndinə bağlanmışam iradə ilə.* S.Ə.Şirvani. ☐ **Kəmənd kimi** – şairanə təşbehlərdə. *Kəmənd kimi tökülübdür gərdənə; Dönübdür sərasər şahmara tellər.* M.P.Vaqif.

◊ **Kəməndə keçmək (düşmək)** – ilişmək, dolaşmaq, tora düşmək, hiylənin qurbanı olmaq. [Qulu:] *Qoca elə kəməndə keçməyib ki, qurtara bilsin.* N.Vəzirov. **Kəməndə salmaq** – tora salmaq, hiylə ilə tutmaq. *Çərxi-fələk saldı məni kəməndə; Buların oduna düşmüşəm mən də.* Aşıq Ələsgər. *Şirin söz*

*ilə saldı o, ahunu kəməndə.* M.Ə.Sabir. [Təlxək əcinnə:] *Xoş gördük, ay mənim gülüm! Yenə kimi kəməndə salıbsan?* Ə.Haqverdiyev.

**KƏMƏNDÇİ** *is.* Ovda heyvanları (atları) kəməndlə tutan adam.

**KƏMƏNDLƏMƏ** "Kəməndləmək"dən *f.is.*

**KƏMƏNDLƏMƏK** *f.* 1. Kəməndə salmaq; kəməndə keçirmək, kəməndlə tutmaq.

2. *məc.* Özünə ram etmək, əl-qolunu bağlamaq, əsarət altına almaq. *Qumru qaçmaq, onu kəməndləmək istəyənlərin əlindən qurtarmaq istəyirdi.* Mir Cəlal.

**KƏMƏNDLƏNMƏ** "Kəməndlənmək"-dən *f.is.*

**KƏMƏNDLƏNMƏK** *məch.* 1. Kəməndə salınmaq, kəməndə keçirilmək, kəməndlə tutulmaq.

2. *məc.* Əl-qolu bağlanmaq, əsarət altına alınmaq.

**KƏMƏR**[1] *is.* [*fars.*] 1. Bax **qayış** 1-ci mənada. *Kəməri qırılmaq. Təzə kəmər almaq. Belinə kəmər bağlamaq.* // Paltar, palto və s.-də belə sarınan uzun ensiz parça; belbağı. *Paltonun kəməri. Paltarın kəmərini* açmaq. □ **Kəmər yeri** – kəmər bağlanan yer; bel. *Şal qarının çiynindən yavaş-yavaş sıyrılıb kəmər yerinə qədər düşdü.* M.Hüseyn. // Keçmişdə paltarın üstündən belə bağlanan qızıl, gümüş və s. ilə bəzədilmiş belbağı, qurşaq; təkbənd. *Qızıl kəmər. Enli kəmər. – Aşıq oldum telə, qız; Kəmər bağla belə, qız; Yarı gücnən tapmışam; Ana doğmaz belə qız.* (Bayatı). [Səlma:] *İştə gümüş kəmər! Həm də yepyeni; Sonra yenə məmnun eylərəm səni.* H.Cavid. *Bəyin enli kəmərindən gümüş qınlı iri bir xəncər sallanırdı.* S.Rəhimov. // Tüfəng qayışı. *..Həcər təkrar papağı başına qoydu, əlini aynalıya atdı, kəməri çiyninə aşırdı.* S.Rəhimov. // Patrondaş mənasında. [Qoca:] *Tüfəngi doldurub aldım əlimə; Kəməri bağladım qoşa, belimə.* "Qaçaq Nəbi". // Ümumiyyətlə, bir şeyin belinə bağlanan, sarınan, dövrələnən ip, qurşaq, çənbər və s. *Çəlləyin kəməri. – Aləm bayram içində idi. Böyük binaların belindən qırmızı kəmər çəkilmişdi.* Mir Cəlal.

◊ **Kəmər bağlamaq** *məc.* – əmrə hazır vəziyyətə gəlmək; hazır, amadə olmaq. **Kəmər kimi** – düz və uzun. *Kəmər kimi cığır. – İlansayağı yol dağların döşündən burularaq kəmər kimi aşağıya doğru burulur.* M.İbrahimov. **Kəmərin altı boş olmaq** – ac olmaq, acımaq. **Kəmərin altını bərkitmək** *zar.* – doyunca yemək, doymaq.

**KƏMƏR**[2] 1. *tex.* İçərisindən su, neft, qaz və s. axıtmaq üçün metal və ya saxsı boru. *Neft kəməri. Su kəməri. Qaz kəməri.*

2. *zool.* Soxulcanın bədəninin qabaq tərəfində qalınlaşmış hissə.

**KƏMƏR**[3] *arxit.* Qapı, pəncərə və s. üstündə yarımdairə (qövs) şəklində tağ. *Qədim incəsənətimiz haqqında qiymətli material verən abidələr içərisində tunc kəmərlər xüsusilə maraqlıdır.* "İncəsənət". // Qövs şəklində tikili. *Körpü kəməri.*

**KƏMƏRBƏND** *is.* [*fars.*] Belbağı, kəmər, qurşaq. *Oğlan gəlir enişdən; Kəmər-bəndi gümüşdən.* (Bayatı).

**KƏMƏRBƏSTƏ** *sif.* və *zərf* [*fars.*] *köhn.* Əmrə müntəzir, xidmətə hazır; amadə. [Əzim bəy:] *Olar həmin xidmət üçün kəmərbəstədirlər.* M.F.Axundzadə. □ **Kəmərbəstə durmaq** *köhn.* – əmrə müntəzir olmaq, hazır durmaq. [Məhəmməd Qacar] *tamam İrana qiblə idi və cümlə xəlayiq onun itaətində böyük xovf ilə kəmərbəstə durmuşdular, hənuz sübh olmamış qəflətən söndü.* F.Köçərli.

**KƏMƏRÇİN** *is.* [*fars.*] Beli çinli (belinə rezin və ya bağ keçirilib çinlənmiş) qadın tumanı. *Kəmərçin geymək. Kəmərçin tikmək. – Mütrüblər təzə kəmərçinlər geyir, saqilər piyalələri hazırlayır, rəqqasələr zinətlərini üstlərinə tökürdülər.* M.S.Ordubadi. [Zərrintac] *gödək paltodan çıxan uzun kəmərçininin qabağını əlində dəstələyib faytona əyləşdi.* S.Rəhimov.

**KƏMƏRLƏMƏ** "Kəmərləmək"dən *f.is.*

**KƏMƏRLƏMƏK** *f.* 1. Kəmərindən yapışmaq, belindən yapışmaq, yerə yıxmaq, kəmərindən (belindən) yapışıb yerə yıxmaq (vurmaq). *Pəhləvan rəqibini kəmərlədi.*

2. Əhatə etmək, dövrələmək, dövrəyə almaq. *Kəndi bir tərəfdən Zəyəm çayı, o biri tərəfdən isə Sarım arxı kəmərləyərək üzük qaşı kimi dövrəyə almışdır.*

**KƏMƏRLƏNMƏ** "Kəmərlənmək"dən *f.is.*

**KƏMƏRLƏNMƏK** *məch.* 1. Belindən tutulmaq, tutulub yerə vurulmaq.

2. Dövrəyə alınmaq, əhatə olunmaq; dövrələnmək. *Kənd yarğanla kəmərlənmişdir.*

**KƏMƏRLİ[1]** *sif.* 1. Belinə kəmər, qayış, belbağı və s. bağlamış; qurşaqlı. *Ağ çuxalı və ağ arxalıqlı, ikiüzlü Buxara dərisindən papaqlı, şişman göbəyi üzərində gümüş kəmərli Mirzə Səfəri hamı tanıyırdı.* Ə.Haqverdiyev. *Əmin qəsrində xəlifə tərəfindən təyin edilən qızıl kəmərli qulamlar, zümrüd və yaqut xalxallı cariyələr və zərinələrə bürünmüş kənizlər Azərbaycan heyətinə xidmət edirdi.* M.S.Ordubadi. // Belinə kəmər tikilmiş, belində kəməri olan. *Kəmərli paltar.* – *..Təzə uzunboğaz çəkmələrdə, qalife şalvarda və iki döş cibi olan beli kəmərli, yaxalıqlı köynəkdə Şirzad yaraşıqlı idi.* M.İbrahimov.

2. Belində qurşaq, kəmər və s. olan; çənbərli. *Kəmərli çəllək.*

**KƏMƏRLİ[2]** *sif. zool.* Kəməri olan (b a x **kəmər[2]** 2-ci mənada). *Soxulcanların arasında qırmızımtıl kəmərli olanlarını tapıb, kəmərin 32-ci halqa ilə 37-ci halqa arasında yerləşdiyinə fikir verməli.* C.Cəbrayılbəyli.

**KƏMƏRLİ[3]** *sif.* Üzərində kəmər kimi çıxıntısı olan; tağlı. *Kəmərli pəncərə.*

**KƏMFÜRSƏT** *sif.* [*fars.* kəm və *ər.* fürsət] Tündxasiyyət, tündməcaz, tez özündən çıxan, kəmhövsələ. *Kəmfürsət adam.* – [Amaliya] *Otellodan əhvalı bilib, başlayır onu danlamağa və ağzına gələn sözləri kəmfürsət ərəbin haqqında söyləməyə.* F.Köçərli. *Camaat arasında* [Salmanın] *nanəcib, kəmfürsət, bədxah olmasından gizlin-gizlin, yavaş-yavaş, lakin mütəmadiyən danışıq gedirdi.* M.İbrahimov. // İs. mənasında. [Məlikə:] *Biganə əgər olmasa, tez vəslə yetərdik; Kim xeyr görüb düşməni kəmfürsət olanda?* Ə.Vahid.

**KƏMFÜRSƏTLİK** *is.* Tündxasiyyətlik, tündməcazlıq, tez özündən çıxma; hövsələsizlik. *Həbibə xala dilləndi: – Almaq istəyir, çox kəmfürsətlik eləyir, ay oğul.* Mir Cəlal.

**KƏMHÖVSƏLƏ** *sif.* [*fars.* kəm və *ər.* hövsələ] Hövsələsi olmayan, hövsələsiz, səbirsiz, tez əsəbiləşən. [Məşədi İbad:] *O cürə evdə böyüyən qız bir az kəmhövsələ olar.* Ü.Hacıbəyov. ☐ **Kəmhövsələ olmaq** – hövsələsizlik, səbirsizlik göstərmək, əsəbiləşmək. [Kərbəlayı Rəcəb:] *Hacı! Dərdin alım, nöşün belə kəmhövsələ olmusan?* N.Vəzirov. [Nəcəfalı:] *A bala, kəmhövsələ olma, axırını gözlə!* B.Bayramov.

**KƏMHÖVSƏLƏLİK** *is.* Hövsələsizlik, səbirsizlik. ☐ **Kəmhövsələlik etmək** – b a x **kəmhövsələ olmaq** ("**kəmhövsələ**"də). [Səkinə xanım:] *Niyə belə kəmhövsələlik edirsən?* M.F.Axundzadə.

**KƏMXÖRƏK** *sif.* [*fars.*] *köhn.* Az yeyən, azca yeməklə doyan. *Kəmxörək adam.* – *Hüseyn Kürd on beş yaşına təzəcə çatmışdı. Amma çox zəif, kəmxörək bir adam idi.* (Nağıl). [Əliqulu:] *Xeyr, ağa, çox kəmxörəyəm.* S.S.Axundov.

**KƏMXÖRƏKLİK** *is.* Az yeyən adamın hal və keyfiyyəti.

**KƏMİLTİFAT** [*fars.* kəm və *ər.* iltifat] b a x **iltifatsız.** *Kəmiltifat olmaq.*

**KƏMİLTİFATLIQ** b a x **iltifatsızlıq.**

**KƏMİNƏ** *sif.* [*fars.*] *klas.* Həqir, miskin, aciz, zavallı, yazıq. *Miskin Füzuliyəm ki, sənə tutmuşam üzüm; Ya bir kəminə qətrə ki, ümmanə yetmişəm.* Füzuli. *Əzim bəy pişxidmətbaşı cavab verdi ki: – Biz sizin kəminə nökərləriniz pişxidmətlərik, mən buların rəisiyəm, bular da mənə tabedirlər.* M.F.Axundzadə.

**KƏMİŞTAHA** *sif.* [*fars.* kəm və *ər.* iştəha] İştahası az olan; iştahasız; *Kəmiştaha uşaq.*

**KƏMİYYƏT** *is.* [*ər.*] 1. Miqdar, qədər, say, ədəd. *Hər yerdə kəmiyyət, keyfiyyət barəsində danışıq gedirdi.* S.Hüseyn. *Tək kəmiyyətə deyil, keyfiyyətə də fikir verməli!*

2. *fiz. riyaz.* Ölçmək və hesablamaq mümkün olan hər şey. *Sonsuz kiçik kəmiyyət. Naməlum kəmiyyət. Dəyişən kəmiyyət. Sıfıra bərabər kəmiyyət. Məchul kəmiyyət.*

3. *fəls.* Xarici aləmin əşya və hadisələrini miqdar, həcm, inkişaf dərəcəsi cəhətdən səciyyələndirən fəlsəfi kateqoriya. *Kəmiyyətin keyfiyyətə keçməsi qanunu. Kəmiyyət dəyişmələri.*

4. *dilç.* Səsləri tələffüzetmə müddəti. *Kəmiyyətə görə səslər uzun və qısa olur.*

**KƏMİYYƏTCƏ** *sif.* və *zərf* Kəmiyyətə görə; sayca, miqdarca. *Kəmiyyətcə artım.*

**KƏM-KARASTI** *top.* [*fars.*] *dan.* 1. Bir sənətdə, peşədə, işdə lazım olan alətlər.

*Dülgər kəm-karastısı.* – [Veys:] *Bütün kəm-karastılarını alıb verək yoxsul şərbaflar işləsinlər.* Ə.Əbülhəsən.

2. Silah, yaraq. [Məşədi Kazım:] *Pişto və sair kəm-karastını götürmüşdür.* M.S.Ordubadi.

**KƏM-KƏM** *zərf* [*fars.*] Az-az, yavaş-yavaş, asta-asta. *Lakin saqın, ölüm günü kəm-kəm yaxınlaşır.* Ə.Nəzmi.

**KƏM-KƏSİR** *is.* [*fars.* kəm və *ər.* kəsr] Çatışmayan cəhət, nöqsan, qüsur, çatışmazlıq. [Tükəzban:] *Heç bir zaddan kəm-kəsir yoxdur.* S.S.Axundov. [Aşıq Alı Ələsgərə:] *– Oğul, sözdərin də xoşuma gəldi, oxumağın da, saz çalmağın da. Az kəm-kəsirin var.* "Aşıq Ələsgər". // *sif.* Çatışmayan. [Musanın nəvəsi] *o gündən işə başladı. Bakıdan bəzi kəm-kəsir şeylərini aldı.* Qantəmir.

**KƏM-KƏSİRLİ** *sif.* Kəm-kəsiri olan; nöqsanlı, qüsurlu.

**KƏMLƏMƏ** "Kəmləmək"dən *f. is.*

**KƏMLƏMƏK** *f.* Xəlbirləmək.

**KƏMLƏNMƏ** "Kəmlənmək"dən *f.is.*

**KƏMLƏNMƏK** *məch.* Xəlbirlənmək.

**KƏMLİK** *is.* Azlıq, yoxluq, əskiklik, çatışmazlıq.

**KƏMMAYA** *sif.* [*fars.* kəm və *ər.* mayə] 1. *köhn.* Mayası az, pulu az; kasıb, yoxsul. *Kəmmaya tacir.*

2. *məc.* Ağıldan kasıb, ağılsız, gic. [Bəy:] *Doğrudan da belə imiş. Nə kəmmaya adam imişsiniz.* Mir Cəlal.

**KƏMMAYALIQ** *is.* Ağıldan kasıblıq, ağılsızlıq, giclik.

**KƏMMƏHƏL** *sif.* [*fars.* kəm və *ər.* məhəl] Adama məhəl qoymayan, diqqət yetirməyən, saymayan, etinasız. □ **Kəmməhəl olmaq** – saymamaq, etinasız olmaq, soyuqluq, etinasızlıq göstərmək. *Xubların yaxşısı olmaz kəmməhəl; İşarə edən tək gələr əlbəəl.* Q.Zakir. *..Kənd müəllimlərinin .. öz peşələrinə bu qədər süst, kəmməhəl və kəmetina olmaqlarına ümdə səbəb onların həddən ziyadə az məvacib almaqlarıdır.* F.Köçərli. *..Nəbini də çağırmışdılar. Bir az kəmməhəl olub, o da getmək istəmədi.* S.Rəhimov.

**KƏMMƏHƏLLİK** *is.* Etinasızlıq, saymazlıq, soyuqluq.

**KƏMRƏNG** *sif.* [*fars.*] Rəngi az, açıq, rəngsiz. *Böyükxanım şad və xürrəm, gümüş podnos içində iki stəkan kəmrəng çay gətirdi.* M.S.Ordubadi.

**KƏMSAVAD** *sif.* [*fars.* kəm və *ər.* səvad] Savadı az, azsavadlı, az oxumuş, savaddan kəm. [Mədəd:] *Sən kəmsavad, haqq-hesabdan nə sənin başın çıxır, nə də mənim.* İ.Əfəndiyev. [Qədir:] *Mən kəmsavad adamam, nə danışım a bala, heç özüm də bilmirəm.* Ə.Sadıq.

**KƏMSAVADLIQ** *is.* Azsavadlılıq, savadı az olma.

**KƏMSƏR** *zərf* [*fars.*] *dan. köhn.* Ağıldan kəm, kəmağıl, ağılsız.

**KƏMSƏR-KƏMSƏR** *zərf dan. köhn.* Axmaq-axmaq, gic-gic. [Gülxanım Alı kişiyə:] *Ay üstünə od tökülsün, nə ilə oxutmaq istəyirsən, .. kəmsər-kəmsər danışma.* "Qatır Məmməd".

**KƏMSİK**[1] *is.* İtin boynuna bağlanan ip, xalta. [Güləli] *..Ala iti kəmsiyindən açıb yanına aldı, ulu babasından qalan çaxmaqlı tüfəngi də çiyninə saldı.* S.Rəhimov.

◊ **Kəmsiyini çeynəmək (gəmirmək)** – hirsindən boğulmaq, son dərəcə hirslənmək, qəzəblənmək, intiqam üçün fürsət axtarmaq. *Fərəc bəyin hirsi daha da çoxalır. Bığlarının ucunu ağzına salıb kəmsiyini gəmirən it kimi çeynəməyə başlayır.* Ə.Vəliyev. **Kəmsiyini qırmaq** – həddini aşmaq, həddini keçmək. **Başına kəmsik salmaq (keçirmək)** – çox incitmək, zülm etmək, əziyyət vermək. [Naçalnik:] *Vallah, dağda atanızı yandıracağam, başınıza kəmsik salacağam.* "Qaçaq Nəbi".

**KƏMSİK**[2] *is. dan.* Çatışmayan, əlavə edilməli olan hissə, parça. *Kəmsiyi var.*

**KƏMSİKLƏMƏ** "Kəmsikləmək"dən *f.is.*

**KƏMSİKLƏMƏK** *f.* 1. Başına, boğazına kəmsik keçirmək, kəmsik salmaq, xaltalamaq; başı kəmsikli halda yanınca aparmaq.

2. *məc.* Noxtalamaq, yüyənləmək.

**KƏMSİKLİ** *sif.* Kəmsiyi olan, boynuna kəmsik salınmış; xaltalı. *Kəmsikli it.*

**KƏMŞİRİN** *sif.* [*fars.*] Azacıq şirin, normadan az şirnisi olan. *Kəmşirin nar. Kəmşirin şərab. – Çayımız kəmşirin, çörək yavan; Kağızlar qam-qam, top-top.* R.Rza.

**KƏMŞİRİNLİK** *is.* Kəmşirin şeyin hal və keyfiyyəti.

**KƏMŞÜUR** *sif.* [*fars.* kəm və *ər.* şüur] Şüuru az, şüursuz, dərrakəsiz. *Olmayıram mən qəyur dərdə nişan olmağa; Mən oluram kəmşüur, sahibi-şan olmağa.* C.Cabbarlı.

**KƏMŞÜURLU(LU)Q** *is.* Şüur azlığı, şüurun çatışmazlığı; şüursuzluq, dərrakəsizlik.

**KƏMTALE** *sif.* [*fars.* kəm və *ər.* tale] Talesiz, taleyi (bəxti) gətirməyən. *Kəmtale adam.*

**KƏMTALELİK** *is.* Talesizlik, bəxtsizlik.

**KƏMTƏR(İN)** *sif.* [*fars.*] *klas.* Alçaq, aşağı; aciz, yazıq, miskin. *Leyli deməyin ki, nazənindir; Bir tirə kənizi-kəmtərindir.* Füzuli. *İbrət et Ağa Məhəmməd xandan, ey kəmtər gəda.* M.P.Vaqif. [Hacı Kamyab:] *Xan, mən sizin kəmtərin nökərinizəm.* Ə.Haqverdiyev.

**KƏMYEK** *sif.* və *is.* [*fars.*] 1. Əsas miqdardan az, əskik, bir az çatışmayan. *Çəkidə kəmyeki düzəltmək.*

2. Hicri təqvimdə 29 gündən ibarət ay. *Ayın kəmyeki var. Kəmyek ay.*

**KƏN** *is.* Döşəmənin altına qoyulan tir, şalban.

**KƏNAF** [*lat.* cannabis-dən] *bot.* Saplağından kəndir alınan bitki.

**KƏNAFLIQ** *is.* Kənaf bitkisi əkilmiş yer, sahə.

**KƏNAR** [*fars.*] 1. B a x **qıraq** 1-ci mənada. *Çayın kənarı. Yolun kənarı. – ..Bir həyətdə bir müsəlman arvadı arxın kənarında qab yuyurdu.* C.Məmmədquluzadə. *Kəndin kənarından get-gedə sıxlaşan və iriləşən qamışlıq başlanırdı.* M.Rzaquluzadə.

2. *sif.* Yad, özgə, başqa. *Cuma evdə kənar adam olmadığını bildi.* Ə.Əbülhəsən.

3. *is.* Özgə yer, tamamilə başqa yer; xaric. *Kənardan gəlmiş adam. –* [Koroğlunun] *bir belə xasiyyəti var ki, kənar yerlərdən gələn karvanları soymur.* "Koroğlu". [Müdir:] *Mən kənardan gəlmiş bir adamam, başım ancaq məktəbin işlərinə məşğuldur.* Ə.Haqverdiyev.

4. *is.* Ətraf, yan. *Rüstəm ayağa qalxdı, evin kənarına səpələnmiş çırpını topladı, həyətdə gur bir ocaq qaladı.* S.Rəhimov.

5. *sif.* və *zərf* Mərkəzdən uzaq, qıraq. *Kənar ev. Kənar tikili. Kənar məhəllə. – Kənarda bir dükan görsənir.* C.Məmmədquluzadə. *Xavər on-on beş addım kənardakı dükanın piştaxtasına söykənərək mürgüləyən qoca çörəkçiyə yanaşdı.* M.İbrahimov.

6. *zərf* Çox vaxt yerlik halda: **kənarda** – uzaqda, aralı. *Daşlıca azı kənddən beş verst kənarda, bağ-bağatlı yolların ayrıcında bir yer idi.* Mir Cəlal.

7. *is.* Məhəccər, sürahi mənasında. *Mehriban əllərini balkonun kənarına dayamış olduğu halda gözü küçəyə baxırdısa da fikri və xəyalı uzaqlarda idi.* S.Hüseyn.

◊ **Kənar etmək (eləmək)** – 1) uzaqlaşdırmaq, rədd etmək. *..Lazımdır mikrobları millətin bədənindən kənar eləmək.* C.Məmmədquluzadə. *Çünki Qızıl Arslan məlikəyə evlənmək üçün Azərbaycan xalqının sevdiyi vəliəhdi kənar edib, məlikənin oğlunu vəliəhd təyin edə bilməzdi.* M.S.Ordubadi; 2) qovmaq, çıxarmaq (işdən, məktəbdən və s). *..Axırda* [Cəlilin] *əlindən molla təngə gəlib onu məktəbdən kənar elədi.* İ.Musabəyov; 3) atmaq, götürmək. [Şah Sitarəyə:] *Sənə hökm edirəm, kənar et örtüyü!* C.Cabbarlı. **Kənar gəzmək (dolanmaq)** – əlaqəni kəsmək, özünü uzaq tutmaq, yaxınlıq göstərməmək, uzaq olmaq. *Əlində fənər gəzər; Gəzdikcə yanar gəzər; Bir kəs ki, yoxsul olsa; Dost ondan kənar gəzər.* (Bayatı). [Qurbani:] *Səbəb nədi məndən kənar gəzirsən? Sirrsözün yadlara deyən deyiləm.* "Qurbani". *Qafil! Dolanma gəl, eşqdən kənar; Ən böyük musiqi canan səsidir.* S.Vurğun. **Kənar olmaq** – uzaqlaşmaq, özünü uzaq tutmaq. [Dərviş Şeyx Sənana:] *Əgər fövqəlbəşər olmaq dilərsən; Kənar ol daima cinsi-bəşərdən.* H.Cavid. [Mansur xan:] *Burada dəxi dayanmayıb, kənar olub tez gedin.* C.Cabbarlı. **Kənar(a) atmaq** – 1) bir yana tullamaq, atmaq. *Arvad əlində toxuduğu corabı kənara atıb, qalxıb ərinin başı altına bir mütəkkə qoydu.* Ə.Haqverdiyev. *..Zərintac xanım bəzəkli yorğanı üstündən kənara atdı, atılıb çarpayısından yerə düşdü.* S.Rəhimov; 2) *məc.* unutmaq, yaddan çıxarmaq, əlaqəni kəsmək, məhəl qoymamaq. *Qul Abbası nə kənara atmısan; Hərcayilə ülfətini qatmısan..* Aşıq Abbas; 3) *məc.* əhəmiyyət verməmək, sərf-nəzər etmək, bir tərəfə buraxmaq. *Mən təklif edirəm ki, müraciətnamə məsələsini tamamilə kənara ataq.* M.S.Ordubadi. **Kənar(a) düşmək** – uzaq düşmək, uzaq olmaq, əlaqəsi kəsilmək. *Müşküldü mən kənara*

*düşüm kuyi-yardən..* Natəvan. *Talasından kənar düşərsə ceyran; Gəzər yoldaşları bir zaman heyran.* M.Rahim. **Kənara çəkilmək** – uzaqlaşmaq, kənar olmaq, bir yana çəkilmək. *Kəndlilərin bir neçəsi çıxdı eşiyə və bir neçəsi oturduğumuz töylədə olan atlardan bir neçəsini yəhərləyib çəkildilər kənara.* C.Məmmədquluzadə. *Həbib bəy özünü göstərməmək üçün bir kənara çəkildi.* S.Rəhman. *Kənara çəkilmə, bil ki, bu gündən; Bu gün mənə varsa, sabah sənə var.* B.Vahabzadə. **Kənara çəkmək** – bir tərəfə çəkmək, qırağa çəkmək, bir tərəfə aparmaq. *Cantək səni kənarə çəkər pullu dayilər; Hər yerdə az deyil səni mehman edən, çocuq!* M.Ə.Sabir. **Kənara çıxmaq** – 1) əsas işdən, məsələdən və s.-dən uzaqlaşmaq. *Mövzudan kənara çıxmaq;* 2) bir qədər aralanmaq, azacıq uzaqlaşmaq. *Xaspolad dəstədən kənara çıxıb əsgəri kazarmaya doğru getdi.* M.Hüseyn. **Kənara tullamaq** – b a x **kənara atmaq**. *Keçən sərgüzəşti tulla kənara; Bihudə hekayət zamanı deyil.* Q.Zakir. *Şaqqulu ağ parçanı kənara tullayıb, gəlinin üzünü görcək cəld geri çəkildi..* Çəmənzəminli. **Kənarda qalmaq** – 1) b a x **kənarda durmaq**. [Zeynal:] *Mehriban, – dedi, – özün etiraf edirsən ki, sənin bizdən kənarda qalmağın münasib deyil.* S.Hüseyn; 2) *məc.* Unudulmaq, yaddan çıxmaq. *Qaldı bütün kənarda; Can verənlər, ölənlər.* Ə.Cavad. // İştirak etməmək (bir işdə). *Bir nəfər də olsun gənc pambıqçı yarışdan kənarda qalmamışdır.* **...kənarda (kənara) qalsın** – ...bir tərəfdə (yanda) qalsın (bir şeydən sərf-nəzər etmək mənasında). *Hələ açıq gəzmək kənarda qalsın..* S.S.Axundov. [Akif:] *İşin çətinliyi bir kənara qalsın..* M.İbrahimov. Kənarda durmaq – qarışmamaq, müdaxilə etməmək, iştirak etməmək. *İşdən kənarda durmaq.* **...kənarda dursun** – b a x **...kənarda qalsın.** [Leyla xanım:] *..Ancaq qoy bu söhbət dursun kənarda.* N.Vəzirov. **Kənardan baxan** – hadisəyə tamaşa edən; görən; seyrçi. *Kənardan baxan nə deyər? – Kənardan baxan əcnəbilər bizə deyirlər.* C.Məmmədquluzadə. *Yandı əhvalına kənardan baxan; Doğdu ürəklərdə min şəfqətli hiss.* M.Rahim.

**KƏNARƏ** *is.* [*fars.*] *köhn.* 1. Kitab səhifələrinin kənarındakı yazı.

2. Haşiyə, qıraq, çərçivə. *Xalçanın kənarəsi. Kəlağayının kənarəsi.*

3. Evin ortasına salınmış böyük xalçanın, gəbənin ətrafına, divar dibinə salınan kiçik xalça.

4. Nəhayət, son, hədd. *Gör nə mühitdir, könül, yoxdur anın kənarəsi.* Nəsimi. *Yaşım suyu oldu varə-varə; Bir bəhr ki, yox ona kənarə.* Füzuli.

**KƏNARƏLİ** *sif.* Kənarəsi olan; haşiyəli. *Kənarəli kəlağayı.*

**KƏNARLAŞDIRILMA** "Kənarlaşdırılmaq"dan *f.is.*

**KƏNARLAŞDIRILMAQ** *məch.* Kənar edilmək, uzaqlaşdırılmaq.

**KƏNARLAŞDIRMA** "Kənarlaşdırmaq"dan *f.is.*

**KƏNARLAŞDIRMAQ** *f.* Kənar etmək, uzaqlaşdırmaq. *Müfəttiş hesabdarı əli ilə kürsüdən kənarlaşdırıb, onun yerində əyləşdi.* S.Rəhimov.

**KƏNARLAŞMA** "Kənarlaşmaq"dan *f.is.*

**KƏNARLAŞMAQ** *f.* Kənar olmaq, uzaqlaşmaq.

**KƏNARSIZ** *sif.* Ucu-bucağı olmayan, nəhayətsiz, sonsuz. *Ay çıxıbdı kənarsız; Niyə məni qınarsız? Açıb desəm dərdimi; Od tutarsız, yanarsız.* (Bayatı).

**KƏND** *is.* Əhalisi, əsasən, kənd təsərrüfatı ilə məşğul olan yaşayış məntəqəsi. *Böyük kənd. Kiçik kənd. – Koroğlu həftədə .. bir özü Qıratı minib ətraf kəndlərə, şəhərlərə çıxardı.* "Koroğlu". *Mənim adım Xəlil və yoldaşımın adı Sadıqdı. Hər ikimiz Danabaş kəndində anadan olmuşuq.* C.Məmmədquluzadə. *Yeddi kənd, üç şəhər görürəm ancaq; Bu dağın başından bir baxışla mən.* B.Vahabzadə. // Kənd yeri, habelə kənd əhalisi. *Şəhərlə kənd arasında olan ziddiyyəti aradan qaldırmaq.* □ **Kənd salmaq** – yaşayış yeri düzəltmək, yeni kənd bina etmək. [Canpolad:] *Bu kənd salınandan bu günə qədər oğurluq hadisəsi görünməyibdir.* M.S.Ordubadi. **Kənd Soveti** *köhn.*– kənd yerlərində Sovet hökumətinin yerli orqanı. *Kənd Soveti iclası. Kənd Sovetinin sədri.* **Kənd Şurası** *köhn.* – b a x **Kənd Soveti.**

[2-ci qadın:] *Elə səni kənd Şurası sədrliyinə namizəd seçmişik.* Ə.Haqverdiyev. *..Güllücə kəndində də kənd Şurası düzəlib, yeni şura yaşayışı başlandı.* S.S.Axundov. **Kənd təsərrüfatı** – xalq təsərrüfatının əkinçilik, heyvandarlıq və meşəçiliyi əhatə edən sahəsi. *Kənd təsərrüfatı qabaqcılları.* **Kənd yeri** – kənd salınmış yer; kənd. *Qorxma, kənd yerində çoxdur qoçaqlar; Hər daşın dibində bir Koroğlu var.* S.Vurğun.

**...kənd** Bir sıra türk dillərində mürəkkəb kənd, qəsəbə və s. yaşayış məntəqələri adlarının ikinci tərkib hissəsi; məs.: Hacıkənd, Daşkənd, Yarkənd, Qasımkənd, Qonaqkənd.

**kənd-kənd** b a x **kəndbəkənd.** *Öldürər bu dərd məni; Doğrayar bənd-bənd məni; Yarım vəfalı olsa; Axtarar kənd-kənd məni.* (Bayatı).

**KƏNDARASI** *sif.* Kəndlərin arasında olan, yerləşən, salınan. *Biz kəndarası yolları da düzəldirik.* S.Rəhimov. *..Rüstəm kişi maşını kəndarası küçələrdən keçirib palçıqlı araba yoluna çıxardı.* M.İbrahimov. [Yusifin] *nəzəri itib-batmaqda olan kəndarası yollara sataşdı, köksünü dərindən ötürdü.* B.Bayramov.

**KƏNDAŞIRI** *zərf* Kəndləri keçərək. *Kəndaşırı şose yoluna çıxmaq.*

**KƏNDBƏKƏND** *zərf* Bir kənddən o biri kəndə, bir-bir kəndləri gəzərək, bir-bir kəndlər üzrə; kənd-kənd. *Kəndbəkənd dolaşmaq. – Vəkillər .. kəndlilərin adlarını, acların sayını və istədikləri pulun qədərini adbaad, kəndbəkənd, hamısını təfsilən yazıb yekə-yekə kitablar bağlamışdılar.* C.Məmmədquluzadə. *Hacı Rüstəmin atası .. xırman zamanında gedib, kəndbəkənd gəzib nisyə yığardı.* Ə.Haqverdiyev.

**KƏNDCİK** *is.* Kiçik kənd.

**KƏNDCİYƏZ** “Kənd”dən *oxş. Göy yamacın ətəyində kəndciyəz; Dörd yanında dalğalanır tarlalar.* A.Şaiq. *İki il əvvəl buraxıb getdiyi həmin kəndciyəzdə onun yoluna göz dikib, onun ümidi və arzusu ilə yaşayan iki göz var idi.* H.Nəzərli. *İndi bu .. kəndciyəz Dilara üçün Bakı qədər əzizdir.* Ə.Məmmədxanlı.

**KƏNDÇİ** b a x **kəndli** 1-ci mənada. *Kəndçi qız. Kəndçi paltarı. – Şəhər stansiyasından dəmir yol bileti alaraq vağzala gedən motal-papaq iki kəndçi çiynində xurcun gəlib mənim yanımda dayandılar.* Qantəmir. [Qoşatxan:] *Həsən bəy hələ həştad il əvvəl demişdi ki, müəllim gərək çıraq kimi yanıb, kəndçinin yolunu işıqlandırsın.* M.İbrahimov.

**KƏNDÇİLİK** b a x **kəndlilik**. *Qədir malqarasını satıb kəndçilik etməkdən əl çəkmiş və qulluqçu olmağı qərara almışdı.* Ə.Sadıq.

**KƏNDXUDA** b a x **kətxuda.** *Belə bir məsələ üçün kəndxuda hər iki məhəllədən adam çağırardı, vəkillər dəvət edərdi.* N.Nərimanov. [Allahverdi:] *Naçalnikə ver, pristava ver, uryadnikə ver, kəndxudaya ver, yüzbaşıya ver, köməkçiyə ver, miraba ver, ver... ver... ver...* C.Cabbarlı.

**KƏNDXUDALIQ** b a x **kətxudalıq.** *Görünür ki, elə o vaxtdan kəndxudalıqda gözü var imiş.* “M.N.lətif.”

**KƏNDİ**[1] *is.* İçində taxıl, un və s. saxlamaq üçün taxta, yaxud palçıqdan qayrılmış qab. *Buğda kəndisi. Un kəndisi. Bir kəndi arpa. – Kənd arvadları qışın tədarükünü qurtarırdı: kimisi hazırladığı unu kəndiyə doldurur, kimisi yarmanı kisəyə yığır, kimisi .. kudu və balqabaqları gizlədirdi.* M.İbrahimov.

**KƏNDİ**[2] *köhn.* b a x **öz.** *Olsa məhbublərin eşqi cəhənnəm səbəbi; Hur-qılmanı qalır kəndisinə rizvanın.* Füzuli. *Qoy börkünü kəc qaşının üstündə, fırılda; Kəndin kimi bir lotiyi-meydanını görgəc.* M.Ə.Sabir. [Zeynal] *bir zamanda ki, Novruz bəylə getməmişdir, kəndisini aldadıb yalan söyləməsindən məqsədi nə idi?* S.Hüseyn.

**KƏNDİR** *is.* Kənaf və ya çətənə liflərindən hazırlanan yoğun, ya nazik ip, ümumiyyətlə, ip. *Tay kəndiri yoğun olar, çarıq kəndiri nazik.* (Məsəl). [Ayı balalarının] *boyunlarına kəndir bağlayıb kəndə gətirirdilər.* A.Şaiq. [Murad:] *Canım, .. bir kəndir gətirin, sarıyın əl-ayağını.* C.Cabbarlı.

**KƏNDİRBAZ** *is.* 1. İp üzərində gəzmək və atılıb-düşməklə cürbəcür oyunlar göstərən adam; canbaz. *Kəndirbazların çıxışı. – Qız uşağını özbaşına buraxsan, .. kəndirbaza ərə getmək istər.* M.S.Ordubadi. [Rəqslərin] *ahəngi altında oynayana və atılıb-düşənə rüstümbaz və ya kəndirbaz deyərlər.* H.Sarabski.

// Bu cür ip üstündə nömrələr göstərən sirk artisti; akrobat.

2. *məc.* Hoqqabaz, oyunbaz. [Əhməd:] *Nədən ötrü məni axtarırsan, ay hiyləbaz, kəndirbaz, oyunbaz, kəkilbaz?* N.Vəzirov. [İsmayıl:] *..Əntərzadə bir maarif işçisi deyil, xaliscə bir kəndirbazdır.* Mir Cəlal.

**KƏNDİRBAZLIQ** *is.* 1. Kəndirbazın peşəsi, sənəti, məşğuliyyəti; akrobatlıq, canbazlıq.

2. *məc.* Hoqqabazlıq, oyunbazlıq. [Kərbəlayı Qulam:] *..Allaha şükür, bir-birimizi yaxşı tanıyırıq, kəndirbazlıq nə lazım, atam?* N.Vəzirov. ☐ **Kəndirbazlıq etmək (çıxarmaq)** – oyunbazlıq etmək, hoqqabazlıq etmək. *Bəs bu Nemətullayev burada nə kəndirbazlıq çıxardır?* S.Rəhimov.

**KƏNDİRQAYIŞ** *sif.* Bərk, möhkəm. ☐ **Kəndirqayış kimi** – bərk-bərk. *Qırsaqqız Xoca Əzizi elə tutdu, elə tutdu ki, kəndirqayış kimi.* “Koroğlu”. **Kəndirqayış olmaq** – tutub (yapışıb) buraxmamaq. *..Oğlan oldu kəndirqayış, qızdan əl çəkmədi ki, çəkmədi.* (Nağıl).

**KƏNDİSTAN** *is.* 1. Kənd, kənd yeri. [Vaqif:] *Xeyr, yanıldınız, ona dil verən; Kəndistan yeridir, bəli, kəndistan.* S.Vurğun. [Hacı Rəsul:] *Belə də səs, belə də məlahət olarmı? Düşünürsən ki,* [Əntiqə] *başər cinsi deyil nədi, özü də kəndistan yerində.* Mir Cəlal. *..Daima qardaşdır Bakı kəndistan.* Z.Xəlil.

2. Kənd əhli, kəndlilər. [Nizami:] *Mən istəyirəm ki, min il bundan sonra da bir nəfər Gəncə üsyanının tarixini oxuduğu zaman desin ki, “üsyan olduqca ağıllı, düşüncəli və tədbirli bir surətdə təşkil edilmiş üsyan idi. Orada yalnız şəhər xalqı deyil, bütün kəndistan da iştirak etmişdi”.* M.S.Ordubadi.

**KƏNDİSTANLI** *is. köhn.* Kəndistanda yaşayan adam; kəndli. [Şahbəy:] *Biz ki kəndistanlıyıq..* Ə.Əbülhəsən.

**KƏND-KƏSƏK** *top. dan.* Kənd və ona yapışıq yer. *Kənd-kəsəyə bələd olmaq.* – [Hacı Bayram:] *Bəy deyiləm, rəiyyətim yox, kənd-kəsəyim yox.* Ə.Haqverdiyev. [Məhərrəm bəy:] *..Kənd-kəsəyi dolandıra bilmirəm.* S.S.Axundov. *Kənddə-kəsəkdə başıpapaqlı qalmayıb, hamısını yığıblar.* Çəmənzəminli.

**KƏNDLİ** *is.* 1. Kənddə yaşayan və əsas peşəsi kənd təsərrüfatı olan adam; kənd əhli, kəndçi. *Ceyranın əri Eldar adlı kəndli bir gənc imiş.* S.Hüseyn. [Nizami] *..qoca kəndlinin şum kənarında açdığı süfrə başında nahar edirdi.* Ə.Məmmədxanlı. ☐ **Təhkimli kəndli** – b a x **təhkimli**.

2. Bir kənddən olan adamlardan hər biri; yerli. *Mənim kəndlim. Öz kəndlimdir.* – [Rəşid:] *Qurbanqulunun atası və babası bizim kəndli olmuşlardır.* T.Ş.Simurq.

**KƏNDLİ-KƏSƏKLİ** *top. dan.* Kəndli.

**KƏNDLİ-KÜTLÜ** *top.* Keçmişdə bəzən kəndliyə, kəndlilərə ikrahla, saymazyana verilən ad. [Əminə Dürdanəyə:] *Səndən olsaydı, çoxdan bu dövləti paylamışdın kəndli-kütlüyə..* Ə.Əbülhəsən.

**KƏNDLİLİK** *is.* Kəndli peşəsi, işi; əkinçilik. *Bu zaman Cəlil istəyirdi ki, bu yeri satıb özü üçün bir dükan açsın və canını kəndlilikdən qurtarsın.* İ.Musabəyov.

**KƏNDSAYAĞI** *sif.* və *zərf* Kənd tipində, kənd tərzində, kənd qaydası ilə, kənddə olduğu kimi. *Kəndsayağı ev.* – *Kəndsayağı bəzənmiş evdə həmin adamla ev sahibi söhbət edirdi.* Q.İlkin.

**KƏNDYANI** *sif.* Kəndin yaxınlığında olan, kəndin yanında yerləşən. *Kəndyanı otlaq.*

**KƏNƏK** *sif.* 1. Ləpəsi çətin çıxan. *Kənək qoz.*

2. *məc.* Çətinliklə başa gələn, həyata keçən. *Kənək iş.* – *Yazıb pozduğum və şagird dəftərindən qopartdığım vərəqlər stol üstündə qalaqlanmışdı və nəhayət işıq ucu görünmüşdü, kənək tənliyin kor düyünü açılmışdı..* Ə.Məmmədxanlı.

3. *məc.* Əlindən yaxşılıq gəlməyən, çətinliklə bir iş düzəldən; tərs, inad, inadkar, inadcıl. *Kənək adam.* – *Uçan bir quş kənəkdir; İşi tamam kələkdir; Dəyirmana can verər; Xırmana da gərəkdir.* (Bayatı).

**KƏNƏKLİK** *is.* 1. Ləpəsi çətin çıxan qoz və s.-nin keyfiyyəti.

2. Kənək adamın xasiyyəti; tərslik, inadkarlıq, inadcıllıq. *Kənəklik eləmək.*

**KƏNGİZ** *is. bot.* Kökü yanacaq kimi işlədilən, qış otlaqlarında yayılan bitki növü. *Camaatın içindən bir dəstə dilmancın yanına yeriyib başladılar and içməyə ki, Məhəmmədəli kətdə deyil, gedib, çöldən kəngiz gətirib satsın.* C.Məmmədquluzadə.

**KƏNGİZLİK** *is.* Kəngiz çox olan yer, kəngiz bitən yer, sahə.

**KƏNİZ** *is.* [*fars.*] *köhn.* 1. Xidmətçi qız, qulluqçu. *Evin kənizi. – Bir gün Mehriban Soltanın kənizlərinə xəbər gəldi ki, filan küçəyə bir bazirgan gəlib.* "Lətif şah". [Hacı Kamyab:] *Xan, mən sizin kəmtərin nökərinizəm, qızım da kənizinizdir.* Ə.Haqverdiyev. [Yetər:] *Mən ölənəcən Dilbər xanımın kəniziyəm, kənizi.* N.Vəzirov. // Qədimdə: kölə kimi bağışlanan qız (qadın), qul qız (qadın); cariyə. *Çaydır, dənizdir; Quldur, kənizdir; Balam hər nədir; Mənə əzizdir.* (Bayatı). *Taxtın iki tərəfində xəlifənin iki nəfər sevimli kənizi durub xəlifəyə yelpik çəkirdilər.* M.S.Ordubadi. *Şairin qəzəllərinə məftun olmuş Dərbənd əmiri onu bu xaraba kənddən öz sarayına dəvət edir və ən gözəl kənizini ona hədiyyə göndərir.* Ə.Məmmədxanlı.

**KƏNİZLİK** *is. köhn.* 1. Qulluqçuluq. [Günay:] *Qoy qismətim qürbətdə kənizlik olsun, amma Barsisim, körpə quzum ac qalmasın, böyüsün boya-başa çatsın.* Ə.Məmmədxanlı.

2. Qədimdə: satılan və ya bağışlanan qızın ya qadının vəziyyəti; cariyəlik. *Kənizlikdən azad etmək.*

**KƏNKAN** b a x **kankan.** *Bir az keçdi, bir neçə kömürçü, kənkan göründü.* Çəmənzəminli. [Suraxanskinin] *oxumağı da quyu dibindəki kənkan səsinə oxşayırdı.* Ə.Haqverdiyev. *Əzablar içində bağrı qan oldu; Çox gəzib axırda o, kənkan oldu.* M.Rahim.

**KƏPƏK** *is.* 1. Un ələndiyi zaman ələk üstündə qalan buğda və s.-nin qabıq qırıntıları. *Arpaya qatsan at yeməz; Kəpəyə qatsan it yeməz.* (Ata. sözü).

2. Ağac, taxta mişarlandığı zaman tökülən xırda ovuntu. *Söz nadan dilində qəpiyə dəyməz; Dəyməz, su üzündə köpüyə dəyməz; Dəyməz, heç bir ovuc kəpəyə dəyməz..* M.Araz.

3. Başda və heyvan tüklərinin dibində əmələ gələn qovaq. *Başında kəpək olmaq.*

4. B a x **kövrək** 1-ci mənada. *Kəpək alma. Kəpək heyva.*

**KƏPƏKLƏMƏ** "Kəpəkləmək"dən *f.is.*

**KƏPƏKLƏMƏK** *f.* Kəpək vurmaq, kəpək qatmaq. *Samanı kəpəkləmək.*

**KƏPƏKLƏNMƏ** "Kəpəklənmək"dən *f.is.*

**KƏPƏKLƏNMƏK** *f.* 1. Kəpək əmələ gəlmək, qabıq vermək. *Başı kəpəklənir.*

2. Kəpək kimi boş olmaq. *Heyvalar kəpəklənmişdir.*

**KƏPƏKLİ** *sif.* 1. Kəpəyi olan, ələnməmiş. // Çoxlu kəpəyi olan. *Kəpəkli un.*

2. Başında və tüklərinin dibində kəpək, qovaq olan. *Kəpəkli baş.*

3. Kövrək, kəpək kimi boş olan. *Kəpəkli alma.*

**KƏPƏKLİLİK** *is.* Kəpəyi olan un və s.-nin keyfiyyəti; kəpəyi olma. *Unun kəpəklilik dərəcəsi.*

**KƏPƏNƏK** *is.* Bədən və qanadları toz kimi incə pullarla və cürbəcür rənglərlə bəzənmiş dördqanadlı böcək. *..Bir gözəl kəpənək gəlib Ağca xanımın oturduğu skamyanın üstünə qondu.* S.S.Axundov. *..Quşların bir paraları oxumaqda, o biri paraları uçub özləri üçün yem gəzməkdə və kəpənəklər çiçəklərin başına qonmaqda idilər.* A.Divanbəyoğlu. *Dünya bahar, ömrün yolu gül-çiçək; Uçur güldən-gülə, qonur kəpənək.* R.Rza. // Pərvanə.

**KƏPƏNƏKVARİ** *sif.* Kəpənək şəklində olan, görünüşcə kəpənəyə oxşar, kəpənək kimi. *Kəpənəkvari bant.*

**KƏPƏNG** *is.* Zirzəmi qapısı, altdan yuxarı açılan qapı; lyuk. *Zirzəmi kəpəngi.*

**KƏPİTKƏ** *is. xüs.* [rus. "конопатить" sözündən] Deşikləri, araları tutmaq üçün (əsasən gəmidə) işlədilən kəndir və s. lifləri.

**KƏPİTKƏLƏMƏ** "Kəpitkələmək"dən *f.is.*

**KƏPİTKƏLƏMƏK** *f. xüs. dan.* Kəpitkə ilə qapamaq, kəpitkə tıxamaq (b a x **kəpitkə**). Deşikləri kəpitkələmək.

**KƏPİTKƏLƏNMƏ** "Kəpitkələnmək"dən *f.is.*

**KƏPİTKƏLƏNMƏK** *məch. xüs. dan.* Kəpitkə ilə qapanmaq, kəpitkə ilə tıxanmaq, bərkidilmək (b a x **kəpitkə**).

**KƏRAHƏT** *is.* [*ər.*] İyrənmə; nifrət hissi, xoşa gəlməmə; ikrah.

**KƏRAHƏTLİ** *sif.* İyrəndirici, nifrət doğuran, ikrahlı.

**KƏRAMƏT** *is.* [*ər.*] 1. Alicənablıq, xeyirxahlıq, mərhəmət, səxavət, lütfkarlıq. *..Bəlkə ağanın fəzilətinin kəramət və mərhəmətindən mənim həmşəhərlilərim bibəhrə qal-*

*masınlar.* C.Məmmədquluzadə. **Kəramət etmək (qılmaq, buyurmaq)** *köhn.* – lütf etmək, bağışlamaq, vermək. [Pəri xanım Vəzirə:] *Allah sənə, qızım Şölə xanımdan bir oğlan kəramət eləsin.* M.F.Axundzadə. **Kəramətə gəlmək** – səxavətə gəlmək, əliaçıqlıq göstərmək; lütf etmək.

2. *köhn.* Müsəlmanların təsəvvürünə görə, övliyalardan, Allahdan və b. müqəddəslərdən sadir olan bəzi xariqülada işlər, ecazkar qüvvə, möcüzələr. *Pir mənimdir, kəramətini bilirəm.* (Ata. sözü). *Ağlamaq möminin əlamətidir; Nəbinin dininin xoş adətidir; Əgər bilsən həqqin kəramətidir; Ta gedincə nuri bəsər ağlarsan!* M.V.Vidadi. [Xortdan:] *Bu pirin kəramətinin nədən ibarət olduğu adından anlaşılır.* Ə.Haqverdiyev.

**KƏRAMƏTLİ** *sif.* 1. Kəramət sahibi, kəraməti olan; mərhəmətli, xeyirxah, lütfkar.

2. *köhn.* Möcüzəli, ecazkar. *O vaxtdan mənim ağzım olub kəramətli.* “M.N.lətif.” *Sultanlara, xaqanlara baş əyməyən əsla; Dərviş kəramətli qələndər yenə varmı?* Ə.Vahid.

**KƏRAMƏTLİLİK** *is.* Kəramət sahibi olma; mərhəmətlilik, xeyirxahlıq, lütfkarlıq.

**KƏRBƏLAYI** *is.* [İraqda imam Əlinin qəbri olan Kərbəla şəhərinin adından] *din.* Həmin şəhərə gedib müqəddəs yerləri ziyarət edən adama verilən ad. *Möhtərəm adamlara kərbəlayı, məşədi, hacı, xozeyin, fəqət ən böyük adama bu məhəllədə əmi deyirdilər.* N.Nərimanov. [Şofer:] *Keçmişdə asan yollarla müftə pul qazanan hacılar, kərbəlayılar çox idi.* M.Rzaquluzadə.

**KƏRÇƏ** b a x **kərə²**. *Kərçə qoyun.*

**KƏRDƏ** b a x **kərdi¹**. *Kərdədə, mərzdə nanə; Yaman göz odda yanə.* (Ata. sözü).

**KƏRDİ¹** *is.* Lək. *İki kərdi soğan əkmək. Kərdiləri sulamaq. – Tank şumlayan həyətlərin kərdisində; Öz yemini; Külə dönmüş pərdisində; Yuvasını itiribdir.* M.Araz. *Bu baxçada aş tərəsi əkərdik; Hey su açıb kərdiyə göz dikərdik.* Şəhriyar.

**KƏRDİ²** *is. bot.* Şaftalı növü.

**KƏRDİYAR** *məh.* 1. *is.* Arpa ilə buğda qarışığı. *Arabadakı kərdiyar taxıl onların üzərinə səpələndi.* S.Rəhimov. [Qarı:] *Təzə buğdanı paylamayıblar, qabağında ölüm! Bu, bildirki kərdiyardı.* M.Hüseyn.

2. *sif. mənasında.* Dağınıq, çalpaşıq, dolaşıq. *Kərdiyar iş. Kərdiyar söz.*

**KƏRƏ¹** *is.* Nehrədən yeni çıxmış, əridilməmiş yağ; şit yağ. *Camış kərəsi. İnək kərəsi. – Mal mənimdir, belə yeyirəm; Əritmirəm, kərə yeyirəm.* (Ata. sözü). *Buyur zəhmət çək, atından düş yerə; Varımızdır qımız, çörək, bal, kərə.* A.Səhhət. *Qızxanım nənə süfrəyə kərə, qoyun qatığı və təzə pendir qoydu.* İ.Əfəndiyev.

**KƏRƏ²** *sif.* 1. Qulaqları çox qısa, dımıq, kərçə (qoyun haqqında). *Bu anda* [Səmədin] *gözü başqa bir kəndlinin sağdığı kərə qoyuna sataşdı.* M.Hüseyn.

2. *kin.* Başı qırxılmış (adam haqqında). Kərə oğlan.

**KƏRƏ³** *zərf* [*ər.*] Dəfə. *İki kərə iki elər dörd. Adama neçə kərə deyərlər. İki kərə getmək. Bir kərə görmək. – Adam adamı bir kərə aldadar.* (Ata. sözü). [Müəllim:] *Mən sizə bir kərə də demişdim ki, bizim yollarımız başqa-başqadır.* S.Hüseyn. ☐ **Bir kərə** – heç. *Görmədik dünyada bir kərə ağ gün; Ciyərimiz yara, sinəmiz dügün!* H.K.Sanılı.

**KƏRƏCİ** *is.* Bir neçə adamlıq dorlu qayıq. *Gəmi, qayıq, kərəci də, kolaz da; Məni heç vaxt incitməmiş bir az da.* A.Səhhət. *Gecənin qaranlığı şərisində Lənkrud çayı ilə aşağı doğru axan kərəcidə .. oturub dalğın və mükəddər bir halda düşünürdüm.* S.Hüseyn.

**KƏRƏCİVAN** *is. məh.* Kərəci sürən, kərəcidə işləyən adam; qayıqçı.

**KƏRƏCİVANLIQ** *is. məh.* Kərəcivanın işi, peşəsi, məşğuliyyəti; qayıqçılıq. *Sarıköynək özünü suya atırsa da öldürə bilməyir. Onu, kərəcivanlıq edən indiki əri ölümdən xilas edir.* S.Hüseyn.

**KƏRƏM¹** *is.* [*ər.*] *köhn.* Lütf, mərhəmət, inayət. *Kərəm eyləmək.* – [Ağa Heydər:] *Xudaya, şükür kərəminə! Balalarım, gəlin sizi bağrıma basım.* N.Vəzirov. ☐ **Kərəm et (qıl)** (yalvarış yaxud nəzakət bildirən əski ifadə) – 1) mərhəmət et, rəhm göstər, lütf et. *Saqi, kərəm eylə, cam gəzdir; Tutma qədəhi, müdam gəzdir!* Füzuli. *Ey gözəllər şahı, kərəm et mana; Baxmagilən hərgiz əğyardan yana.* M.P.Vaqif; 2) verin, ödəyin. [Məstəli şah:] *Xanım, divlərin əlmuzdunu, ənamını kərəm edin!* M.F.Axundzadə. **Kərəm sahibi (əhli)**

*köhn.* – lütfkar, rəhmdil, mərhəmətli, insaflı, alicənab adam haqqında. *Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər; İşlənən işlərdə əhkamü ləyaqət görmədim.* M.P.Vaqif.

**KƏRƏM**[2] "Kərə[3]" sözünün canlı danışıq dilində işlənən yanlış forması. [Sərçə] *üç kərəm balasın suva basıb, alıb tazadan dimdiyinə apardı.* (Nağıl). [Böyükxanım:] *Bir kərəm sənin yanında üzüaçıq dayanmışammı, səsimi eşitmisənmi?* C.Cabbarlı.

**KƏRƏMİ** *is. mus.* Azərbaycan aşıq havalarından birinin adı. *Balabançı genə durub gəlir Aşıq Cəfərin yanına, Aşıq Cəfər kərəmi oxuyur.* Ə.Haqverdiyev.

**KƏRƏMLİ** *sif.* Mərhəmətli, lütfkar, insaflı, rəhmli. *Könül qəmgin, ürək dərdli, vərəmli; Səni gördüm səxavətli, kərəmli.* Aşıq Ələsgər. *Kərəmli padşah, rəhm eylə mana; Al mənim könlümü, yetir canana.* Aşıq Rəcəb.

**KƏRƏMLİLİK** *is.* Lütfkarlıq, mərhəmətlilik, alicənablıq.

**KƏRƏMSİZ** *sif.* İnsafsız, mərhəmətsiz, rəhmsiz. *Səxavət olmayan kəsdə şücaət feli nadirdir; Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.* M.V.Vidadi.

**KƏRƏN** *is. məh.* Yonulmamış yoğun ağac, dirək, iri kötük. *Evin kərəni sınmışdır. – El yığılsa, kərən sındırar.* (Ata. sözü). *El bir olsa dağ oynadar yerindən; Söz bir olsa zərbi kərən sındırar.* A.Tufarqanlı. *Kərəni, pərdəsi hörümçək toru; Deyirlər, kasıbın bilinməz goru.* S.Vurğun. □ **Kərənə dönmək** – şişmək. *Ayağı kərənə dönübdür.*

**KƏRƏNAY** *is.* [*fars.*] *köhn.* 1. Nəfəslə çalınan uzun boru şəklində qədim musiqi aləti (adətən təntənələrdə, qələbə bayramlarında çalınardı). *Kərənayi-şadiyanə başlandı çalınmağa.* M.F.Axundzadə. *Vəliəhd atın üstünə qalxdığı zaman yüzlərcə təbil, kərənay və şeypurlar səsləndi.* M.S.Ordubadi.

2. Hislik, dudkeş.

**KƏRƏNAYXANA** *is.* [*fars.*] *köhn.* Kərənayların birdən çalması. *Günəş Həməl bürcünə yaxınlaşdığı dəqiqədə .. vurulan kərənayxana Novruz bayramı mərasiminin başlandığını xəbər verdi.* M.S.Ordubadi.

**KƏRƏNTİ** b a x **dəryaz.** *..Merac yenə də kərəntini götürüb ot çalmağa başladı.* Ə.Vəliyev. [Şamxal] *kərəntini çiyninə alıb, pəncərəsi Kürə baxan evlərinin qənşərindəki cığırla asta-asta yuxarı qalxdı.* İ.Şıxlı.

**KƏRƏNTİÇİ** *is.* Kərənti ilə ot çalan adam; dəryazçı.

**KƏRƏNTİÇİLİK** *is.* Kərəntiçinin işi, peşəsi; dəryazçılıq.

**KƏRƏNTİLƏMƏ** "Kərəntiləmək"dən *f.is.*

**KƏRƏNTİLƏMƏK** b a x **dəryazlamaq.**

**KƏRƏNTİLƏNMƏ** "Kərəntilənmək"dən *f.is.*

**KƏRƏNTİLƏNMƏK** b a x **dəryazlanmaq.**

**KƏRƏNTİLİK** *is.* Hər dəfədə kərəntinin ağzına gələn miqdar (adətən saylarla). *Bir kərəntilik ot.*

**KƏRƏSKƏ** *is. k.t.* 1. Qoyun damının bir tərəfində quzular üçün ayrılmış yer. *Qamışdan düzəldilmiş kərəskə.*

2. B a x **arxac.**

**KƏRƏVİZ** *is. bot.* Çətirçiçəklilər fəsiləsindən 1-2 illik ot-bitki. *İki dəstə kərəviz. Xörəyə kərəviz doğramaq.*

**KƏRƏYAĞI** b a x **kərə**[1]**.**

**KƏRGƏDAN** *is.* [*fars.*] *zool.* Başının qabaq tərəfində bir, ya iki buynuzu olan. Asiyada və Cənub-Şərqi Asiyada yaşayan otyeyən, məməli iri heyvan. *Bir keçi qaçıban qurtulsa qurddan; Baxar buynuzuna kərgədan olu.* "Koroğlu". *El kömək duranda qula, yoxsula; Onu şir, kərgədan, fil yıxa bilməz.* Aşıq Şəmşir.

**KƏRİM** *sif.* [*ər.*] Kərəm və səxavət sahibi, lütf və ehsan sahibi, inayətkar; kərəmli, mərhəmətli (çox vaxt Allaha verilən sifətlərdən biri kimi). *Ahla-vayla çıxar kasıbın canı; Ölənəcən deyər: – Allah kərimdir.* (Ata. sözü). *Dəmirçioğlu hey çağırdı kərimi; Dost yolunda qoymuş idim sərimi.* "Koroğlu".

**KƏRİMLİK** *is.* Lütfkarlıq, inayətkarlıq; lütf, kərəm, inayət. [Güllü:] *İndi sən acından ölməklə Allah kərimlikdən düşəcək?* Ə.Haqverdiyev.

**KƏRİŞKƏ** *is.* İçi dəlik ağaca geydirilən, ensiz, yastı, gödək, iti polad tiyəsi olan dülgər aləti.

**KƏRKƏ** *is. zool.* Şirin sularda yaşayan, diri bala doğan balıq.

**KƏRKƏS** *is.* [*fars.*] *zool.* b a x **keçələkərkəs.** *Qara kərkəs. Leş kərkəsi. Ağbaş kərkəs.* – [Səfər:] *Ancaq arabir havada nəş arzu-*

*sunda gəzən kərkəslərdən savay bir canlı görünmür.* Ə.Haqverdiyev.

**KƏRKİ** *is.* Aşağı çevrilmiş enli tiyəsi olan uzunsaplı, yonucu (kəsici) alət. *Kərki ağacı yastısına yonar, balta dikinə.* (Məsəl). *Kərki olub öz tərəfinə yonma; Ərrə ol, iki tərəfə yon.* (Ata. sözü). *Əlisa .. yarıehtiyatla hərlənib qazmadüsər, bel, balta, kərki, mişar və qeyri karastı toplanmış anbara girdi.* S.Rəhimov. // Kərkiyə oxşayan şey haqqında. [Soldatın] *tükləri qarışıq, sallaq idi, bunların arasından kiçik kərki çənəsi güclə gözə dəyirdi.* Ə.Əbülhəsən.

**KƏRKİLƏMƏ** "Kərkiləmək"dən *f.is.*

**KƏRKİLƏMƏK** *f.* Kərki ilə yonmaq. *Taxtanı kərkiləmək. Ağacı kərkiləmək.*

**KƏRKİLƏNMƏ** "Kərkilənmək"dən *f.is.*

**KƏRKİLƏNMƏK** *məc.* Kərki ilə yonulmaq. *Ağac kərkilənmişdir.*

**KƏRKİNCƏK** *is. zool.* Kiçik şahin; tərlan, qızılquş.

**KƏRMƏ** b a x **gərmə²**. [Kəndlilər] *qorxularından uşaqları kərmə qalaqlarının içində gizlədib .. deyiblər ki, bizim kənddə heç qədimdən uşaq olmaz.* C.Məmmədquluzadə. *Şeylərin bir qismini samana və kərməyə, bir hissəsini yağa və pendirə dəyişdik.* Ə.Vəliyev.

**KƏRPİC** *is.* Düzbucaq şəklində qəliblənmiş (bişmiş və ya çiy) gildən hazırlanan tikinti materialı. *Kərpic istehsalı. Kərpic kəsmək. Çiy kərpic. Bişmiş kərpic. Qırmızı kərpic. – Bu qala bizim olaydı; Kərpici qızıl olaydı; Yara qonaq gedəndə; Gecələr uzun olaydı.* (Bayatı). [Yolçu] *şəhər yolundan dönərək kərpic zavoduna yol alır.* Mir Cəlal. // Kərpicdən tikilmiş, kərpic döşənmiş. *Kərpic ev. Kərpic döşəmə. Kərpic divar. – İmran kişi atını ağaca bağlayıb, kərpic cığırla kolxoz idarəsinə yanaşdı.* M.Hüseyn. // *dan.* Kərpic şəklində olan, kərpicə oxşayan. *Kərpic çörək.*

**KƏRPİCARASI** *sif.* Tikintidə kərpiclərin arasında olan. *Kərpicarası boşluq. Kərpicarası məsafə.*

**KƏRPİCATAN** *is.* Tikintidə aşağıdan yuxarıya (bənnaya) kərpic verən (atan) fəhlə; kərpicverən, kərpicçi.

**KƏRPİCBAĞLAMA** *is. xüs.* Tikinti işində kərpicləri düzmə üsulu.

**KƏRPİCÇİ** *is.* 1. Kərpic kəsməklə məşğul olan adam.

2. B a x **kərpicatan.**

**KƏRPİCÇİLİK** *is.* Kərpicçinin sənəti, işi, peşəsi. *Kərpicçilik etmək.*

**KƏRPİCXANA** *is.* Kərpic hazırlanan, kəsilən yer; kərpic karxanası.

**KƏRPİCİ** *sif.* 1. Bişmiş kərpic rəngində olan; qırmızı. *Kərpici parça. Kərpici maşın. Kərpici şal. – Qırıq pəncərələrinin hərəsinin yanında bir dəmir çarpayı qoyulmuş, üstü qırmızı kərpici adyallarla örtülmüşdü.* M.İbrahimov.

2. Kərpic şəklində olan; dama-dama. *Aslan .. kərpici dəftərdə süpürgə tüklü bir dəvə .. və bir göyçək dəvə balası çəkdi..* S.Rəhimov. *Şəhərin bütün küçələri ya asfaltla, ya da kərpici qara daşlarla döşənmişdir.* M.İbrahimov.

**KƏRPİCKƏSƏN** *sif.* Gildən qəlib vasitəsilə kərpic kəsən, hazırlayan. *Kərpickəsən fəhlə. – Nazim çıxıb fikirlərini dedi, kərpickəsən maşının modelini, hərəkət cədvəlini də gətirib göstərdi.* Mir Cəlal. // İs. mənasında. *Təbib də, alim də, kərpickəsən də; Qəlbində yaşadır o böyük günü.* S.Vurğun.

**KƏRPİCQURUDAN** *sif.* Kərpiclərin qurudulması üçün hazırlanmış (bina, tikinti). *Kərpicqurudan anbar.*

**KƏRPİCLİ** *sif.* Kərpicdən tikilmiş, ya kərpic döşənmiş. *Kərpicli küçə. – Qara çiy kərpicli binanın üst balkonunda Həcər aynalını bir parça ağ əsği ilə silib təmizləyirdi..* S.Rəhimov.

**KƏRPİCVERƏN** b a x **kərpicatan.**

**KƏRRAT** [*ər.* "kərrə" söz cəmi] *köhn.*: **kərrat ilə** – dəfələrlə. *Şəhərin böyükləri və başbilənləri kərrat ilə biçarə əhalini məsləhət və məşvərətə toplayırlar.* F.Köçərli. [Bahadır] *ixtiyarsız Yusifi qucaqladı, sonra Sonanın əllərini tutub kərrat ilə öpdü.* N.Nərimanov. *Sübhanverdizadə yazdığını kərrat ilə oxudu və son dərəcədə bəyəndi. S.Rəhimov.*

**KƏRRƏ** [*ər.*] b a x kərə³. *Bir kərrə düşəndə xəbər al badi-səbadan; Saçın həvəsi gör ki, məni saldı nə halə.* M.P.Vaqif. [Gülçöhrə:] *Bəs sən məni bir kərrə görməklə xoşladın?* Ü.Hacıbəyov. [Həmzə:] *Adə, bir kərrə de, qız razıdır, vəssalam!* C.Cabbarlı.

**KƏRT** *is.* Ağac parçasının iki yoğun yeri arasında çuxur, ya qazılmış nazik yer.

**KƏRTƏNKƏLƏ** *is. zool.* Uzunsov bədənli, uzun quyruqlu, üstü sərt pulcuqlarla örtülü, iki cüt qısa və zəif ayağı olan sürünən heyvan. *Orta məktəbin zoologiya kursunda sürünənlər bəhsində kərtənkələ, ilan, tısbağa və timsahlar haqqında qısa məlumat verilir.* C.Cəbrayılbəyli. // *məc.* Aciz, əlsiz-qolsuz adam haqqında. [Elxan:] *Aqşin, Aqşin, unutma ki, mən udula biləcək bir kərtənkələ deyiləm.* C.Cabbarlı. *Molla dayı! Oğluma bax sən hələ; Gör nə deyir bircə bu kərtənkələ.* Ə.Nəzmi. // *məc.* Hiyləbaz, əl altından iş görən adam haqqında. *İlana ağı verən kərtənkələ.* (Məsəl). [Nüşabə:] *Ey kərtənkələ, gəl hiyləni burax! Gözünü gizləmə, üzümə dik bax!* A.Şaiq. [Rüstəm:] *Hara gedirəm, bu kərtənkələ* [Qoşatxan] *qabağıma çıxır.* M.İbrahimov.

**KƏRTİK** *is.* Kəsici alətlə ağacda, taxtada və s.-də açılan diş, çərtik, nişan.

**KƏRTİLMƏ** "Kərtilmək"dən *f.is.*

**KƏRTİLMƏK** *məch.* Üzərində kəsici alətlə kərtik açılmaq. *Şalban kərtildi.*

**KƏRTLƏMƏ** "Kərtləmək"dən *f.is.*

**KƏRTLƏMƏK** b a x **kərtmək**[1].

**KƏRTLƏNMƏ** "Kərtlənmək"dən *f.is.*

**KƏRTLƏNMƏK** b a x **kərtilmək.**

**KƏRTMƏ** "Kərtmək[1]"dən *f.is.*

**KƏRTMƏK**[1] *f.* Kərt, kərtik açmaq. *Ağacı kərtmək* (ağaca kərt vurmaq, diş-oyuq açmaq).

**KƏRTMƏK**[2] *is.* Kir, pasaq, çirk, qartmaq.

**KƏS** *əvəz.* [*fars.*] Şəxs, adam, kimsə. *Səxavət olmayan kəsdə şücaət feli nadirdir; Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.* M.V.Vidadi. *O kəsləri deyib gəlmişəm ki, mənim söhbətimi xoşlayıb, bəzi bəhanələr ilə məndən qaçıb gedirlər..* C.Məmmədquluzadə. [Məstur:] *Yad kəsə bağlıdır bütün yollar; Buna, zənnimcə, bircə tədbir var.* A.Şaiq. ◻ **Bir kəs** – bir adam, kimsə. [Leyla:] *Bir kəsim varsa mənim; Harun, yenə sənsən və sən.* Ü.Hacıbəyov. [Leyla xanım:] *Bir kəs yoxdur, qardaş, təkəm..* N.Vəzirov. [Hacı:] *Baxdım, yox idi yaxında bir kəs; Gəldi qulağıma bir həzin səs.* C.Cabbarlı. **Heç kəs** – kimsə, heç kim, bir nəfər də, bir adam da. *Otaqda heç kəs yoxdur. Küçələrdə heç kəs yox idi. Heç kəsə bir söz demə.* – [Hacı Murad:] *..Heç kəsi buraya qoymazsan.* S.S.Axundov. *Nə qədər ki, Cavahir atasının evində idi, heç kəs bunun işini təqdir etməyirdi.* T.Ş.Simurq. **Hər kəs** – 1) hər bir adam, hər biri, hər şəxs. *Hər kəsdən bacarığına görə, hər kəsə tələbinə görə.* // Hamı. *Oğul atasının təbiətini hər kəsdən yaxşı bilirdi.* S.Rəhimov; 2) kim, hər kim. *Xalq ilə hər kəs necə rəftar edər; Haqq onu ol dərdə giriftar edər.* A.Səhhət. *Hər kəs baxıb həqiqətdə, əncir ağacının dibində şamın yandığını görürdü..* Ə.Haqverdiyev.

**KƏSAD** b a x **kasad.**

**KƏSAFƏT** *is.* [*ər.*] 1. Natəmizlik, çirkinlik, kirlilik; çirk. [Səlim:] [Zeynalın] *çamur və kəsafətini yumaq üçün bir neçə vedrə su lazımdır.* S.Hüseyn.

2. B a x **kəsiflik.**

**KƏSAFƏTLİ** *sif.* Çirkli, kirli. *Dükan olduqca hisli, kirli, kəsafətli idi, burada nəfəs almaq belə mümkün deyildi.* M.S.Ordubadi. [Qonağın] *kəsafətli boynu və yaxası nəzər-diqqəti cəlb edirdi.* S.Hüseyn.

**KƏSALƏT** *is.* [*ər.*] Fəaliyyətsizlik, hərəkətsizlik; ölgünlük, süstlük, əzginlik, kefsizlik. *Çox yatmaq kəsalət gətirər.* (Ata. sözü). *Bu nə heyrət, bu nə xəcalətdir; Səndə, axır, bu nə kəsalətdir?* S.Ə.Şirvani. *Nə kəsalətlə iş görürsən sən; Niyə bunca ağır hörürsən sən?* M.Ə.Sabir. *Dağıldı qəmləri, üzləri güldü; Bayaqkı kəsalət tamam töküldü.* H.K.Sanılı. ◻ **Kəsalət basmaq** – ağırlaşmaq, süstləşmək, tənbəllik basmaq. *Hacı Mirzə Əhməd ağadan ayrılandan sonra məni bir kəsalət basıb, daha cənnəti səyahət etmək həvəsindən düşdüm.* Ə.Haqverdiyev.

**KƏSALƏTLİ** *sif.* Ölgün, süst, kədərli, soyuq. *Məclisimiz çox kəsalətli və kədərlidir, – dedi.* M.S.Ordubadi. *Uryadnik Qulu .. kəsalətli gözlərini Zeynal bəyə döndərdi..* Çəmənzəminli.

**KƏSALƏTLİLİK** *is.* Ölgünlük, süstlük, soyuqluq.

**KƏSB** *is.* [*ər.*] 1. Çalışıb qazanma və bunun nəticəsində əldə edilən qazanc, gəlir. *Atanın kəsbi oğula halaldır.* (Ata. sözü). [Tarverdi:] *Belə adamlar da var dünyada? Yaxşı, kəsbimiz nədir?* M.F.Axundzadə. *İsmayılov .. öz kəsbi ilə özünü və ailəsini bir*

*növ dolandırırdı.* Ə.Haqverdiyev. ◻ **Kəsb etmək (qılmaq)** – 1) çalışıb qazanmaq, gəlir götürmək. *Derlər otur evdə, nədim kasibəm; Kəsb eləməzsəm, qazana bilmirəm.* M.Ə.Sabir; 2) əldə etmək, qazanmaq, öyrənmək. *Hər vilayətdə var beş-on məktəb; Edirik kəsb onda elmü ədəb.* S.Ə.Şirvani. *Getdikcə Mehman daha artıq iş təcrübəsi kəsb edir, ciddiyyətlə işə girişirdi.* S.Rəhimov. *Mehriban üçün həyat yeni böyük bir məna kəsb etməyə başlayırdı.* H.Seyidbəyli.

2. B a x **kəsbkarlıq.** [Hacı Qara:] *A qardaş, mən dinc, fərağat, kəsb əhliyəm.* M.F.Axundzadə. *Hansı bir kəsbə yanaşdım ki, yar olsun tale; Sən çıxıb qarşıma, hər ləhzədə oldun mane.* A.Səhhət. [Məşədi Əsgər] *hələ on iki yaşında olduğu halda kəsb üçün Bakıya gəlib, neft gəmilərinin birisində muzdurluğa başlamışdı.* S.Qənizadə. ◻ **Kəsb etmək** *köhn.* – yaşamaq üçün bir sənət, peşə, işlə məşğul olmaq. *Kəsb etmədi, cib kəsmək adət etdi; Quldur oldu, ev kəsdi, qarət etdi.* A.Səhhət.

**KƏSBKAR** *is.* [*ər.* kəsb və *fars.* kar] *köhn.* 1. Peşə, sənət, iş, məşğuliyyət. *Yenə də xalqı torpağından, tarlasından, kəsbkarından ayırmaq lazım gələcəkdir.* M.S.Ordubadi. *Hərənin bir peşəsi, kəsbkarı var.* Mir Cəlal.

2. Kəsbkarlıqla məşğul olan adam; zəhmətkeş, əməkçi.

**KƏSBKARLIQ** *is.* Yaşamaq üçün pul qazanmaq məqsədilə bir işlə, bir peşə ilə məşğul olma; məşğuliyyət, sənət, peşə. *Kəsbkarlıqdan əlin çıxdı, usan! Ər olan yerdə, görüm yox olasan!* M.Ə.Sabir. [Tacir Məcnuna:] *Burax atın cilovunu, yolçapan! Halal kəsbkarlığım oğurluq niyə olur?* Ə.Məmmədxanlı. ◻ **Kəsbkarlıq etmək (eləmək)** – yaşamaq üçün bir işlə, bir peşə ilə məşğul olmaq. [Hacı:] *Ay müsəlmanlar, axı bu nə işdir, niyə qoymursunuz kəsbkarlığımızı eləyək?* Mir Cəlal.

**KƏSDİRİLMƏ** "Kəsdirilmək"dən *f.is.*

**KƏSDİRİLMƏK** "Kəsdirmək"dən *məch.*

**KƏSDİRMƏ** "Kəsdirmək"dən *f.is.*

**KƏSDİRMƏK** 1. *icb.* Başqasına kəsmək işi gördürmək. *Şalbanın başını kəsdirmək. Ağacı kəsdirmək. İtin quyruğunu* (*qulağını*) *kəsdirmək. Meşəni kəsdirmək. Meynələri kəsdirmək.* – [Səfər bəy:] *Kəsdirəcəyəm qoyunu, bişirdəcəyəm kababı.* B.Talıblı. [Səkinə Rüstəmə:] *Özün deyirsən ki, stol açacağam, qoyun kəsdirəcəyəm, düyü islatdıracağam.* M.İbrahimov.

2. *f.* Bir yerdə dayanıb gözləmək, dayanıbdurmaq, durub əl çəkməmək. *Aslan isə, vaxt keçir, deyə, obaşdan gedib vağzalı kəsdirib oturdu.* C.Cabbarlı. [Zərifə:] *Sabah tezdən maarif şöbəsinin qapısını kəsdirdim.* T.Ş.Simurq. *Nədənsə* [Hacı Sultanı] *yenə nikbət tutdu. Alacaqlılar qapısını kəsdirdilər.* S.Hüseyn. ◻ **Yanını kəsdirmək** – birinin yanından əl çəkməmək, daim yanında olmaq. *Xəstənin yanını kəsdirmək.* – [Ağcaqız:] *Şahsənəm düz bir saatdır ki, kəsdirib yanını, ayılmayırsan.* "Aşıq Qərib". [Kərəm:] *Kəsdirəydim yastığının yanını; Bir tutaydım kirpiyinin sanını.* "Əsli və Kərəm". *Qulu səhər tezdən mədənin yanını kəsdirmişdi.* A.Şaiq.

3. *icb.* Verməyə qoymamaq, davam etdirməyə mane olmaq, icazə verməmək, saxlamaq. *Təqaüdünü kəsdirmək. Qazı* (*suyu, işığı*) *kəsdirmək.*

4. *icb.* Sifarişlə bir şey hazırlatmaq. [Koroğlu:] *Əzəldən bilsəydim sənin halını; Əşrəfidən kəsdirərdim nalını.* "Koroğlu".

5. *icb.* Biçdirmək. *Paltarlarını kəsdirmək.*

6. *icb.* Çəpərlətmək, hasarlatmaq, aranı çəpər (hasar, barı) ilə böldürmək. *Aranı kəsdirmək.*

7. *f.* Qəti qərara gəlmək; müəyyənləşdirmək. *Ezamiyyətə getməyi kəsdirdi. – Beləcə aydın bir mühakimədən sonra Qurbanlı öz aləmində Ruhnəvazla evlənməyi kəsdirdi.* Çəmənzəminli. // Təxmin etmək, başa düşməyə çalışmaq. *İndi o və mən bir-birimizin gözlərinə baxıb, kimin sözə başlayacağını kəsdirmək istəyirdik.* H.Nəzərli.

8. *f. köhn.* Sünnət etdirmək. *Uşağı kəsdirmək.*

◊ **Kəsdirə bilməmək** – müəyyən edə bilməmək, qətiləşdirə bilməmək; təxmin edə bilməmək, qərara gələ bilməmək. *Ulduz bunun nə demək olduğunu, hara düşdüyünü kəsdirə bilmədi.* Ə.Məmmədxanlı. *Qız ..* [Adiləyə] *nə cavab verəcəyini, onunla nə tərzdə danışacağını kəsdirə bilmədi.* Q.İlkin.

**KƏSƏ** 1. *sif.* Ən yaxın, ən qısa. *Kəsə cığır.* – [Qız] *cəld taxçadan cunayı yaylığını götü-*

*rüb özünü çölə saldı, kəsə yolla meşəyə doğru yüyürməyə başladı.* Ə.Məmmədxanlı. *Bir azdan zəmilər arası ilə salınmış tozlu kəsə yolda bir yük maşını göründü.* Q.İlkin. *Dağların başından aşdı piyada; Yolu kəsə getdi, yolu qısaltdı.* B.Vahabzadə. ☐ **Kəsə gəlmək** – kəsə (qısa) yolla gəlmək. *Bu dağdan kəsə gəldi; Yolları kəsə gəldi; Sübhün səsi ucaldı; Ellər də səsə gəldi.* (Mahnı).

2. *zərf* Qısa, müxtəsər, yığcam. *Kəsə danışmaq.* – [Hümmət:] *Təbliğat yox, Yusif, sözümə kəsə cavab ver.* B.Bayramov. ☐ **Kəsə eləmək** – qısaltmaq, qısa eləmək, müxtəsər eləmək. [Şahmar] *ona görə də söhbətini kəsə eləyib, ev sahiblərinin harada olduğunu soruşmaq istədi.* B.Bayramov.

**KƏSƏB** *is. köhn.* Müxtəlif alətləri qoymaq üçün dəridən və s.-dən düzəldilən, xüsusi gözləri olan qab, alət. *Kərbəlayı Qulu qurtarıb ülgücü belindəki qayış kəsəbinə qoydu.* Çəmənzəminli.

**KƏSƏBƏ** *is.* [*ər.* "kasib" söz cəmi] *köhn.* Zəhmətkeş, fəhlə, peşəkar, sənətkar; ümumiyyətlə, kəsbkarlıqla dolanan adam. *Hər vilayətdə var beş-on kəsəbə; Əlli min seyyidü axund, tələbə.* S.Ə.Şirvani.

**KƏSƏBƏLİK** *is. köhn.* Fəhləlik, peşəkarlıq, sənətkarlıq, kəsbkarlıq.

**KƏSƏK** *is.* Quruyub bərkimiş palçıq yumrusu. *Kəsəkləri əzmək. – Kəsək oturub daş üçün ağlayır.* (Ata. sözü). *Ayaqlarım yalın olduğuna görə yolun quru kəsəkləri məni incitdi.* A.Divanbəyoğlu. *Tahirlə yanaşı gedən İmran kişinin ayaqları kəsəklərə dəydikcə elə bil daşa dəyirdi.* M.Hüseyn. ☐ **Kəsək kimi –** bərk. *Kəsək kimi quru cad çörəyi* [Arazı] *doyurmadı.* A.Şaiq. *Varlığı daş kimi, kəsək kimi sərt; Bir insan eşqilə gülməyənlər var.* S.Vurğun.

**KƏSƏKDÖYƏN** *is.* Kəsək əzən alət. *Kəsəkdöyənlə kəsəkləri əzmək. – Qurutəzən, kəsəkdöyən, öz malımızdır, dustan! O qəviheykəl qazan Samü Nəriman malıdır.* M.Ə.Möcüz.

**KƏSƏKƏS** *is.* Kütləvi qırğın, qılıncdan keçirmə. *Lələ yerin Arqalı; Mələməz ay arqalı; Kəsəkəs meydanında; Namərd qaçar, ər qalı.* (Bayatı). *Eləysə, ah, eləysə, bəs bu kəsəkəs neçin? Qılınc verib əlinə şahla sultan bəs neçin?* B.Vahabzadə.

**KƏSƏK-KÜSƏK** *top.* Kəsək-kəsək halında olan torpaq. [Maya:] *Tülkü, çaqqal mənə nə edəcək? Nə çox kəsək-küsək, götürüb çırparam təpəsinə.* M.İbrahimov.

**KƏSƏKLƏŞMƏ** "Kəsəkləşmək"dən *f.is.*

**KƏSƏKLƏŞMƏK** *f.* Kəsək olmaq, kəsəyə çevrilmək, qalıb kəsək halında bərkişmək. *Palçıq qalıb kəsəkləşdi.*

**KƏSƏKLİ** *sif.* Kəsəyi çox olan, kəsəklə dolu, kəsəklərlə örtülü. *Kəsəkli yol. – ..Tehrandan gələn boz maşın Qəzvinin tozlu və kəsəkli küçələrinə daxil oldu.* M.İbrahimov. *Bayram .. kəsəkli cığıra burulanda yaxın evlərdən qalxan itlər ağız-ağıza verib hürüşdülər.* M.Hüseyn.

**KƏSƏKLİK** *is.* Kəsək çox olan yer (yol və s).

**KƏSƏN** *f.is. hənd.* Əyrini iki və ya bir neçə nöqtədə kəsən düz xətt. ☐ **Kəsən (kəsici) diş(lər)** – ağzın ön tərəfində olan ön diş(lər).

**KƏSƏR** *is.* 1. Hər hansı bir kəsici alət. *Atam hazırlanır əlində kəsər; Toyuq banlayanda başı kəsilər.* S.Vurğun. // Soyuq silah. *Yoxdur onun əllərində; Heç bir kəsər, heç bir silah.* M.Dilbazi.

2. Kəsmə qabiliyyəti; kəsicilik, itilik. *Bıçaqda kəsər qalmayıb. – Zavallı, silahsız və kimsəsiz həbəşlərin boynunda faşist cəlladları öz qılıncının kəsərini yoxlayırdı.* M.İbrahimov.

3. *məc.* Təsir qüvvəsi; güc, qüvvət. *Sözün kəsəri yoxdur. – Ala gözlərində kəsər qalmadı; O şaqraq səsindən əsər qalmadı.* Ə.Cavad. [Tərxan:] *Hanı onlarda o kəsər, o hünər? Yüzünü bir əliağaclı yenər.* A.Şaiq.

4. **Kəsərlə** şəklində *zərf* – qətiyyətlə. *Muxtar da eyni qətiyyət və kəsərlə Gəldiyevin üzünə baxdı və dedi..* Mir Cəlal.

◊ **Kəsərdən düşmək** – 1) kütləşmək, korşalmaq. *Dəhrə kəsərdən düşüb, itiləmək lazımdır;* 2) *məc.* təsirini itirmək, gücdən (təsirdən) düşmək, təsiri olmamaq, öz kəskinliyini itirmək. *Sözü kəsərdən düşüb.*

**KƏSƏRLİ** *sif.* 1. Yaxşı kəsən, iti. *Kəsərli alət. Kəsərli bıçaq. Kəsərli xəncər. – Ortadan kəsərli, qəbzəsi qanlı; İstərəm indidən çalhaçal ola!* "Koroğlu".

2. Düz vuran, yaxşı atan. *Kəsərli tapança. – Kəsərli silah quldurun əlinə keçəndə, vay*

*doğru və düz vətəndaşların halına!* M.İbrahimov. *Mən, cavan oğlanın belə kəsərli tüfənginin nə tüfəng olduğunu bilmək üçün alıb baxdım.* M.Rzaquluzadə.

3. *məc.* Təsirli, kəskin, inandırıcı. *Kəsərli danışıq. Kəsərli nitq. Kəsərli dəlil. – Qələmin axtarır ayrı bir peşə; Elə ki, kəsərli söz tapa bilmir.* M.Araz.

◊ **Kəsərli nəfəs** – gəlişindən, danışığından yaxşılıq gözlənilən adam haqqında. *Deyirlər sənin çox kəsərli nəfəsin var.* "M.N.lətif". [Qızlar:] *Səni görüm, nəfəsin kəsərli olsun.* Mir Cəlal.

**KƏSƏRLİLİK** *is.* 1. Kəsərli olma; itilik. *Baltanın kəsərliliyi.*

2. *məc.* Təsir, güc, kəskinlik. *Sözün kəsərliliyi.*

**KƏSƏRSİZ** *sif.* 1. Kəsəri olmayan, iti olmayan; küt. *Kəsərsiz balta.*

2. *məc.* Gücü, təsiri olmayan və ya az olan. *Kəsərsiz söz. Kəsərsiz tənqid. – Onlar oynadıqca istedadıyla; Əql evi boş olur, sözü kəsərsiz; Döşünə döysə də alim adıyla; Yaşayır əsərsiz, ölür əsərsiz...* S.Vurğun.

**KƏSƏRSİZLİK** *is.* 1. Kəsəri, itiliyi olmama; kütlük.

2. *məc.* Gücü, təsiri olmama və ya az olma. *Tənqidin kəsərsizliyi.*

**KƏSƏRTİ** *is.* Kəsər, alət (bıçaq, balta, xəncər və s.). *Yanında bir kəsərti yoxdur.*

**KƏSƏSİNƏ** *zərf* Kəsə yolla, qısa yolla. *Kəsəsinə getmək.*

**KƏSƏYƏN** *is. zool.* Qabaq dişləri yaxşı inkişaf etmiş, gəmiricilər dəstəsindən çölsiçanı. *Anbar kəsəyənsiz olmaz.* (Ata. sözü). *Bir tısbağa, bir kəsəyən, bir qarğa; Yoldaş olmuşdular bundan qabağa.* Q.Zakir.

**KƏSHAKƏS** *is.* 1. Kütləvi şəkildə kəsmə, doğrama: qırıb-tökmə, kəsib-tökmə.

2. *məc. dan.* Ağalıq etmə, vurub dağıtma, hökmranlıq (yalnız mənfi mənada). *Bu xəbər açıqcasına hacının yüzbaşılığından, kəshakəs vaxtından verilirdi.* Mir Cəlal. *Oğrular, əyrilər kəshakəsdədir: Tale cəllad kimi hər gün qəsdədir.* H.Arif.

**KƏSİCİ** *sif.* 1. Kəsən, kəsə bilən hər şey. *Kəsici alət. Kəsici maşın.* // İti, itilənmiş, yaxşı kəsən. *Kəsici mişar.* ☐ **Kəsici dişlər** – ağızın qabaq tərəfində olub yeyiləcək şeyi kəsən dişlər. // *İs. mənasında.* Kəsən alət. *Kəsicini itiləmək.*

2. *məc.* Şiddətli, bərk, çox təsirli. *Kəsici külək* (*şaxta*). – *Qılınc kimi kəsici şaxtanın şiddətilə; İştə çürük bir ağac cansız uzandı yerə.* M.Müşfiq. *Havada kəsici bir sazaq olduğundan dəmir peçi də qalatdırmışdım.* M.İbrahimov.

**KƏSİCİLİK** *is.* 1. Kəsici şeyin hal və keyfiyyəti; itilik.

2. *məc.* Şiddət, təsirlilik, təsir qüvvəsi.

**KƏSİF** *sif.* [*ər.*] 1. Qalın, qəliz, qatı, qeyri-şəffaf, tutqun. *Gilanın üzərində qalın bir sis, günəşin ziyasına mane ola biləcək kəsif bir kölgə vardı.* S.Hüseyn. *Ətrafı kəsif bir duman bürüdü.* H.Nəzərli.

2. Ağır, boğuq, nəfəsi çətinləşdirən; ağır və pis qoxuyan; kəsafətli. *Firidun məhbəsin ağır və kəsif havasına heç cür alışa bilmirdi.* M.İbrahimov. *Adamların burnunu və boğazını acışdıran kəsif çürüntü iyi ətrafı bürümüşdü.* P.Makulu. [Xəlil Mirzə] *maxorka tüstüsündən və kəsif havadan bir dəqiqə də olsun çimir eləyə bilmədi.* Q.İlkin.

3. Natəmiz, pinti.

**KƏSİFLƏŞDİRİLMƏ** "Kəsifləşdirilmək"-dən *f.is.*

**KƏSİFLƏŞDİRİLMƏK** *məch.* Qəlizləşdirilmək, qatılaşdırılmaq, tutqunlaşdırılmaq.

**KƏSİFLƏŞDİRMƏ** "Kəsifləşdirmək"dən *f.is.*

**KƏSİFLƏŞDİRMƏK** *f.* Kəsifliyini artırmaq, kəsif etmək; qatılaşdırmaq, qəlizləşdirmək, tutqunlaşdırmaq.

**KƏSİFLƏŞMƏ** "Kəsifləşmək"dən *f.is.*

**KƏSİFLƏŞMƏK** *f.* Kəsif olmaq, kəsifliyi artmaq; qatılaşmaq, tutqunlaşmaq, qəlizləşmək. *Kəsifləşən* (f.is.) *qaranlıqda onlar artıq ağır-ağır qalxır, çox vaxt qarşılarına çıxan meşəliklərdə cığırı itirirdilər.* Ə.Məmmədxanlı. *Axşamın məxmər qaranlığı getdikcə kəsifləşir.* İ.Əfəndiyev.

**KƏSİFLİK** *is.* Qatılıq, qəlizlik, tutqunluq; qeyri-şəffaflıq. *Havanın kəsifliyi.*

**KƏSİK** 1. *sif.* Kəsilmiş halda olan, iti bir şeylə kəsilib yaralanmış, cızılmış. *Kəsik üz. Kəsik dəri. – Şaxta kəsik yerə daha bərk təsir edir.* Mir Cəlal.

2. *sif.* Kəsilmiş, kəsilib götürülmüş, kəsilib atılmış. *Kəsik barmaq* (*bilək*). – *Kəsik baş*

*söyləməz.* (Məsəl). [Əvvəlinci:] *Malların əgər nişanları lazımsa deyim: – Birinin buynuzu qaradır, özü də arıq, qulağı kəsikdir..* N.Nərimanov. [Qızıl it] *..kəsik qulaqlarını oynadaraq qalın, boğuq səsi ilə hürər, nəşəmi pozardı.* A.Şaiq. *Kəndin qənşərinə çatanda Ataşın gözü birdən boz eşşəyin kəsik qulağına sataşdı..* Ə.Vəliyev.

3. *sif.* Kəsilib qısaldılmış, gödəldilmiş. *Kəsik hörük.* – [Qızın] *sarı kəsik saçı xələtin yaxasına tökülmüşdü.* Ə.Əbülhəsən.

4. *is.* Yarıq, kəsilmiş, tikilməyib açıq qoyulmuş yer (paltar və s.-də). *Pencəyin kəsiyi. Tumanın kəsiyi.*

5. *is.* Bir şeyin yaralaya (kəsə) biləcək qırığı, sınığı, parçası, tikəsi, hissəsi. *Stəkan kəsiklərini yığmaq. Şüşə kəsiyi.* // Qırıq, tikə, kəsilmiş parça. *Ağac kəsiyi. – Ağa əlini yanına atıb odun kəsiyini götürdü.* S.Rəhimov.

6. *sif.* Qırıq, kəsik-kəsik, uzun sürməyən, davam etməyən. *Kəsik fit. Kəsik səs. – ..Ağılların qapısını kəsmiş itlərin kəsik hürüşləri gecənin qara pərdəsini yırtıb uzağa gedirdi.* M.İbrahimov. *Salon sakit, fəqət hərdən; Gəlir kəsik hıçqırıqlar.* B.Vahabzadə.

7. *is. xüs.* Boru və s. şeylərin kəsilmiş yeri. *Borunun kəsiyi.*

8. *is. tar.* Çar Rusiyasında 1861-ci ildə təhkimçilik hüququ ləğv edildikdən sonra kəndlilərə verilən kiçik torpaq hissəsi; nadel.

9. *sif. məc. dan.* Sahibsiz, başsız, yiyəsiz (uşaq, qadın haqqında). *Kəsik uşaq. Kəsik qız. Kəsik qadın.* // İs. mənasında. *Öz kəsiyimizdir.*

**kəsik-kəsik** *zərf* Qırıq-qırıq, ara verərək, aramla. *Ancaq məhkəmə salonundan bu qayda ilə çıxan kəsik-kəsik xəbərlər heç kəsi təmin edə bilməyirdi.* T.Ş.Simurq. .. [Uşaq] *kisədən bir ovuc dən götürüb həyətə səpdi və kəsik-kəsik fit verdi.* M.Rzaquluzadə. *Hardasa lap yaxında, deyəsən buxarının yanında, divardakı yarıqlardan birində gizlənmiş qarafatma kəsik-kəsik oxumağa başladı.* İ.Şıxlı. ☐ **Kəsik-kəsik etmək (eləmək)** – doğramaq, parçalamaq, hər tərəfini (yerini) kəsmək. *Parçanı kəsik-kəsik eləmək. Şüşə əlimi kəsik-kəsik etdi.*

**KƏSİK-KÜSÜK** *top. dan.* Kəsiklər, kəsik parçalar.

**KƏSİKLİ** *sif.* Kəsiyi olan. *Kəsikli pencək.*

**KƏSİKLİK** *is.* Kəsik şeyin halı, kəsikli olma.

**KƏSİKSAÇ(LI)** *sif.* Saçı kəsilmiş, qısaldılmış, gödəlmiş. *Kəsiksaç qadın. – Ağ xələtli, kəsiksaç bir qız, əlində kiçik bir yol çantası maşından düşdü.* M.Hüseyn.

**KƏSİLİ** *sif.* Kəsiyi olan; kəsilmiş. *Kəsili qol.*

**KƏSİLİŞ** *is.* Kəsilmə tərzi; kəsilmə. *Layın geoloji kəsilişi. – Sahənin geoloji kəsilişi müəyyən edilmiş mexaniki xassələr vasitəsilə dəqiqləşdirilir.* S.Quliyev.

**KƏSİLİŞMƏ** "Kəsilişmək"dən *f.is.*

**KƏSİLİŞMƏK** *qarş.* Hesablarını bitirmək, bir-biri ilə hesablaşıb, şərtləşib qurtarmaq; üzülüşmək.

**KƏSİLMƏ** "Kəsilmək"dən *f.is. Cəlil ceyranın kəsilməsinə razı olmadı.* M.Hüseyn. *Planın dolmamasının səbəbi tez-tez elektrik enerjisinin kəsilməsi olmuşdu.* Ə.Əbülhəsən.

**KƏSİLMƏK** 1. "Kəsmək"dən *məch. Taxta kəsildi. Barmağı kəsilmək. Qardan yol kəsilmişdir. Qoyun kəsilmək. Telefon* (*qaz*) *kəsildi. Meynələr kəsilib. Kərpic kəsilmək. Pul kəsilmək.*

2. *f.* Bitmək, qurtarmaq, sakitləşmək. *Molla gəlib mağaraya çatana qədər yağış kəsilir.* "M.N.lətif." *Həmin saat külək və qar kəsildi.* M.Rzaquluzadə. // Daha eşidilməmək, gəlməmək (səs və s. haqqında). *Quşlar uçdu, əkildi; Vay, səsləri kəsildi.* A.Səhhət. *Doğrudan da azca keçməmiş qanlı boğuşma və hürüşmələr yavaşıdı və nəhayət kəsildi.* M.İbrahimov. *Mahnı kəsildi, küçədə sükut əmələ gəldi.* S.Rəhman. // Sona çatmaq, qurtarmaq, bitmək. *Müharibə kəsildi. Mübahisə kəsildi.* // Kəsmək, toxtamaq. *Ağrı kəsildi. Yaranın qanı kəsildi.*

3. *məch. köhn.* Sünnət edilmək.

4. *məch.* Cəza təmin edilmək. *Cərimə kəsilmək.* – [Əsəd bəy:] *Aydəmirə vur-tut beş il kəsilmişdir.* C.Cabbarlı. ☐ **İş kəsilmək** – məhkəmənin hökmü ilə müqəssirə müəyyən il həbs cəzası verilmək. [Bəhmən Xəlilə:] *Niyə sənə bu qədər iş kəsiblər? Səkkiz il çox deyil?* İ.Məlikzadə.

5. *məch.* Yarılmaq, oğurlanmaq. *Ev kəsilib.*

6. *məch. dan.* İmtahanda hər hansı bir fəndən pis qiymət almaq, imtahandan keçmə-

mək. *İmtahandan kəsilmək. Kimyadan kəsilmək.*

7. *f.* Məhrum olmaq (qalmaq), tamamilə tükənmək. *Taqəti kəsilmək. İştahası kəsilmək. Südü kəsilmək. – Babək əlində şam, təkbaşına ağır və yorğun addımlarla Cavidan qəsrinin yeraltı qatına düşdü. Zirzəmiyə enən daş pilləkən başında sanki taqəti kəsildi..* Ə.Məmmədxanlı. // Bir şeydən qalmaq, artıq edə bilməmək. *Yeməkdən kəsilmək.*

8. Bir sıra isimlərlə birləşərək mürəkkəb fel və ifadələr düzəldilir; məs: ayağı kəsilmək, əli kəsilmək, çarəsi kəsilmək, düşmən kəsilmək.

**kəsilə-kəsilə** *zərf* Sıxıla-sıxıla, utana-utana, çəkinə-çəkinə. *Kəsilə-kəsilə cavab vermək. – Kəsilə-kəsilə danışır Gülnaz: – Xanlıqda işləyib, olmuşdum pərvaz.* H.K.Sanılı.

◊ **Kəsilə-kəsilə qalmaq** – bir şey edə bilmədiyi üçün daxili əzab və iztirab keçirmək, qovrula-qovrula qalmaq. *Məktubu oxuduqda qanım başıma vurdu, kəsilə-kəsilə qaldım.* M.S.Ordubadi.

**KƏSİM** *is.* 1. Kəsmək işi; kəsmə, kəsiliş, kəsiş.

2. Biçim, tərz, şəkil. *Gözüm qaldı siyah teldə; Bülbül öldü meyli güldə; Bir kəsim yox qürbət eldə; Sən mana qəmxar ol, yaylaq!* Aşıq Ələsgər.

3. Kəsilmiş, müəyyən edilmiş, qərarlaşdırılmış, təyin edilmiş miqdar, norma.

**KƏSİNTİ** *is.* Kəsilmiş parça; qırıntı, qırıq. *Ağac kəsintisi.* – [Xanpərvər bəyim:] *..Elə adamlara mən qızımın kəsinti dırnağını da qıymaram verim!* N.Vəzirov.

**KƏSİR**[1] *is.* [*ər.*] 1. Nöqsan, çatışmazlıq, çatışmayan cəhət, şey; naqislik, əgər-əskik. *İşdə kəsir çoxdur. Tərbiyə işindəki kəsir.* – [Gülzar:] *.. Hər şeyim var, şükür Allaha, heç bir zaddan kəsirim yoxdur.* S.S.Axundov. *Bir nəğmə qoşmadım hələ mən sənə; Dağlar bunu mənə kəsir sanmasın.* B.Vahabzadə. // Planın və s.-nin yerinə yetirilməsində natamamlıq, gerilik, naqislik, çatışmazlıq. *Tresti kəsirdən qurtarmaq üçün birinci növbədə müşavirə və nitqləri ixtisara salmaq lazımdır.* M.Hüseyn. *Pambıq planını kəsirdə qoymayacağıq.* Mir Cəlal.

2. Zərər, ziyan: çatışmayan hissə, əskik. [Cavahir:] *Bikə dedi ki, .. Ağcanın ürəyi sınıqdı. Onun taylarının dörd-beş uşağı var... Sandığım doludu, qızın heç nədən kəsiri yoxdu.* İ.Məlikzadə.

3. **Kəsirlə** şəklində *zərf* – natamam şəkildə, tam olmayaraq, tələb olunandan az. *Tapşırığı kəsirlə yerinə yetirmək.*

**KƏSİR**[2] b a x **kəsr.**

**KƏSİRLİ** *sif.* 1. Çatışmayan, natamam cəhəti olan, normadan az olan. // Nöqsanlı, əskik, naqis.

2. Zərərli, ziyanlı.

**KƏSİRLİLİK** *is.* Nöqsanlılıq, naqislilik.

**KƏSİRSİZ** *sif.* Kəsri olmayan; nöqsansız, qüsursuz.

**KƏSİRSİZLİK** *is.* Nöqsansızlıq, tamlıq.

**KƏSİŞMƏ** "Kəsişmək"dən *f.is.*

**KƏSİŞMƏK** 1. *f.* Bir nöqtədə bir-birini kəsmək, bir-birinin üstünə düşmək. *Məftillərin kəsişdiyi yer. Dəmiryol xətləri kəsişmir. Yolların kəsişdiyi nöqtədə. – Tavandan təkəm-seyrək elektrik fanarları asılmışdı. Onların içində ildırım zolaqları kimi kəsişən işıq telləri şəhərin elektrik stansiyasının motor səsinə uyğun olaraq gah şiddətlənir, gah da öləziyirdi.* İ.Şıxlı.

2. *f. riyaz.* Bir-birini qət etmək, kəsmək. *Kəsişən* (f.is.) *xətlər.*

3. *qarş. məc.* Razılığa gəlmək, müəyyən bir qərara gəlmək; razılaşmaq, uzlaşmaq. *Qiymətdə kəsişmək.* – [Hacı Rüstəm] *bazara gündə yüz taks qoysunlar, danışıb kəsişməsə idi, yarım girvənkə soğan da almazdı.* Ə.Haqverdiyev.

**KƏSKİ**[1] *is. tex.* Kəsici ağzı olan, kəsməyə yarayan alət, həmçinin bu alətin əsas kəsən hissəsi; kiçik balta.

**KƏSKİ**[2] *is. köhn.* Qaçaq-quldur tərəfindən çıxış yolu tutulmuş yer. *Kəskiyə düşmək. Kəskidən qurtarmaq.*

**KƏSKİN** *sif.* 1. İti. *Kəskin qılınc. – Meydan görmüş atı olsa; Zülfüqarı kəskin olur.* "Koroğlu". *Müharibə günündə kəskin bir silah olur; Mənim əlimdə qələm.* S.Rüstəm.

2. *məc.* Şiddətli, güclü, təsiredici. *Havada kəskin şaxta olmasa da, soyuq bir külək vardı.* M.İbrahimov.

3. Çox güclü, şiddətli. *Fərş eylədiyim sinəmi hər gün qədəmində; Kəskin təməim süf-*

*rədəki nanın üçündür.* M.Ə.Sabir. *Onun solğun yanaqlarında qəribə bir qızartı, gözlərində isə kəskin parıltı qaynayırdı.* Ə.Əbülhəsən.

4. Hiss orqanlarına güclü təsir edən; qıcıqlandırıcı. *Kəskin qoxu. Ətrin kəskin iyi. Günəşin kəskin şüaları.* // Güclü, çox bərk. *Kəskin ağrı. Kəskin sızıltı.* // Sürətlə və güclü keçən, daimi olmayan (xəstəliklər haqqında).

5. *məc.* Aydın, olduqca yaxşı nəzərə çarpan, görünən. *Üzün kəskin cizgiləri. Kəskin boya. Kəskin nəzərə çarpmaq.* // Birdən-birə baş verən, çox böyük, ciddi. *Kəskin dəyişiklik. Havalar kəskin surətdə soyudu.*

6. Gərgin, ağır. *Kəskin vəziyyət. Münasibət kəskindir.*

7. *məc.* Qaba, kobud, nəzakətsiz, incəlikdən məhrum. *Kəskin cavab. Kəskin söz* (*ifadə*). *Çox kəskin* (z.) *danışmaq.* // *məc.* Sərt, amansız, qəti, təsirli. *Kəskin tənqid. Əsərə kəskin rəy vermək.*

8. *məc.* Nüfuzedici, iti. *Kəskin baxış. – Kəskin nəzərlə baxmaq.*

9. *məc.* Çox inkişaf etmiş, çox incə, çox həssas; iti (qulaq, göz, hafizə və s. haqqında). *Çox kəskin hafizəsi var.* // *məc.* Ağıl, zəka, idrak haqqında. *Kəskin zəkası var. Uşağın çox kəskin zehni var.*

10. *məc.* Qəti, tərəddüdsüz. *Məsələ kəskin* (z.) *qoyulur. – Araz bu sözləri o qədər qəti və kəskin bir səslə dedi ki, Əlisəfa .. artıq bir söz demədi.* A.Şaiq. *Gözəl simalı, qəti baxışlı və kəskin sözlü bu gənc hamının hüsntəvəccöhünü qazandı.* Çəmənzəminli.

**KƏSKİNLƏŞDİRİLMƏ** "Kəskinləşdirilmək"dən *f.is.*

**KƏSKİNLƏŞDİRİLMƏK** "Kəskinləşdirmək"dən *mach. Məsələ* (*vəziyyət*) *daha da kəskinləşdirilmişdir.*

**KƏSKİNLƏŞDİRMƏ** "Kəskinləşdirmək"dən *f.is.*

**KƏSKİNLƏŞDİRMƏK** *f.* Daha da kəskin etmək; gərginləşdirmək. *Münasibəti kəskinləşdirmək.*

**KƏSKİNLƏŞMƏ** "Kəskinləşmək"dən *f.is.*

**KƏSKİNLƏŞMƏK** *f.* 1. İtilənmək.

2. *məc.* Daha da şiddətlənmək, artmaq, güclənmək. *Şaxta bir az da kəskinləşmişdi.* M.İbrahimov.

3. *məc.* Daha da kəskin olmaq, gərgin olmaq; gərginləşmək. *Münasibətləri kəskinləşdi.*

**KƏSKİNLİK** *is.* 1. Kəsici şeyin xassə və keyfiyyəti; itilik. *İnsan, qılıncının kəskinliyi ilə qəhrəman ola bilməz.* M.S.Ordubadi.

2. Kəskin şeyin hal və keyfiyyəti, xassəsi. *Qoxunun kəskinliyi. Ağrının kəskinliyi. Vəziyyətin kəskinliyi. Cavabın kəskinliyi. Tənqidin kəskinliyi. Sözün* (*ifadənin*) *kəskinliyi. Soyuğun* (*küləyin*) *kəskinliyi. Şüanın kəskinliyi. Zəkanın* (*zehnin*) *kəskinliyi. Hafizənin kəskinliyi.*

3. **Kəskinliyi ilə** şəklində (bəzən "bütün" sözü ilə) *zərf mənasında* – çox güclü surətdə, aydın surətdə, kəskin surətdə. [Qətibə Nizaməddinə:] *Çox təəssüf edirəm ki, mən Hüsaməddinlər kimi avam və sadə adamlarla iş görürəm. İnsan, qılıncının kəskinliyi ilə qəhrəman ola bilməz.* M.S.Ordubadi.

**KƏSMƏ**[1] 1. "Kəsmək"dən *f.is.* [Cahangir ağa:] *Pəricahan, atanın bizim tərəfə gəlməyinə ümidim yoxdur, çünki həmişə buyurmada, vurmada, kəsmədə ömür sürmüş.* S.S.Axundov. ☐ **Kəsmə əlifba** – tədris məqsədi ilə müxtəlif formalarda kəsilmək üçün düzəldilmiş əlifbadan ibarət əyani vasitə. *Bəzi məktəblərimizdə uşaqlar hərfi tanıya bilmir, kəsmə əlifba üzərində işləmirlər.* M.İbrahimov. **Kəsmə yol (cığır)** – kəsə yol, yaxın yol, ən qısa yol. *Nəbi atını minib başqa kəsmə yollarla özünü yoldaşlarına yetirir.* "Qaçaq Nəbi". [Dursun:] *Bu yolların qurdu deyilmiyəm? Kəsmə cığır ilə gedərəm! – dedi.* A.Şaiq. [İkinci işçi:] *Gəl buradan kəsmə yol ilə gedək, evə tez yetişərik.* S.Rəhman.

2. *Sif. mənasında.* Kəsilmiş, kəsik. *Göstərdilər Xaqana; Kəsmə telli bir qızı.* Ə.Cavad.

**KƏSMƏ**[2] b a x **kəsməşikəstə.** *İndi bir kəsmə hava çalın.* Çəmənzəminli.

**KƏSMƏ**[3] *is.* Alçaq növlü xırda düyü. // Xırda dənli yarma, yarma ovuntusu.

**KƏSMƏCƏ** *zərf* Kəsib bəyənmək şərti ilə (qovun-qarpız haqqında). *Kəsməcə satmaq. Kəsməcə almaq.*

**KƏSMƏK** *f.* 1. Kəsərti vasitəsilə bütövdən bir hissə ayırmaq; bölmək, parçalamaq. *Çörəyi kəsmək. Ağacın budağını kəsmək. İpi kəsmək.* – [Koroğlu] *durnanın telindən bir dəstə kəsib, Eyvazın papağına sancdı.* "Koroğlu".

*Mağaza sahibi iki arşın yarım ölçüb kəsdi, sonra kağıza qoyub Bahadıra verdi..* N.Nərimanov. [Çingiz:] *Cəbi lələ, get. Piri babanın tərifl ədiyi balından kəs, yeyək.* S.S.Axundov. // Öz vəzifəsini görmək (kəsici, iti şey haqqında). *Bıçaq yaxşı kəsir. Balta kəsmir.*

2. Kəsən alətlə yarmaq, yaralamaq. *Əlini kəsmək. Barmağını kəsmək.* // Kəsən alətlə ucunu almaq, kəsib götürmək. *Saç kəsmək. Dırnaq kəsmək.* // Kəsib atmaq, kəsib götürmək (cərrahiyyə əməliyyatı zamanı). *Sağ qıçını kəsmək. Baş barmağını kəsdilər.* – *Mən çox ağır yaralanmışdım, sağ qolumu dibindən kəsmək qorxusu vardı.* S.Hüseyn. *Şərəfoğlunun qarnını yarmış, bağırsağını kəsib tikmişdilər.* M.İbrahimov. // Boğazlamaq, başını bədənindən ayırmaq. *Toyuq kəsmək. Qoyun kəsmək.* – [Qaraçılar] *quzunu kəsib damaqla yeməyə başlayırlar.* "Qaçaq Nəbi". [Hacı Murad:] *..Kim sənə izin veribdir ki, toyuq kəsirsən?* S.S.Axundov. *Məmməd kişi həyətdə təzəcə kəsdiyi qoyunu şaqqalayırdı.* S.Rəhman. // Təkərləri ilə üzmək, kəsib aralamaq (qatar, tramvay və s. haqqında). *Tramvay oğlanın sol qıçını kəsdi.* ◻ **Bir-birini kəsmək** – kəsişmək, bir-birinin üstündən keçmək. *Bir-birini kəsən, istiqaməti seçilməyən təkər izləri, deyəsən, dünənkilərdir.* Mir Cəlal.

3. Bədəni sıxan bir şeydən ağrı hiss etmək. *Rezin ayağımı kəsir. Toqqa belimi kəsir.* – [Həmzə] *yüyəni qorxudan elə dartır ki, dəhnə az qalır atın cövzələrini kəssin.* "Koroğlu".

4. Qısaltmaq, gödəltmək. *Saçını kəsmək. Paltarın ətəyindən kəsmək.*

5. Şiddətli təsir etmək, kəskin ağrı vermək, göynətmək. *Şaxta kəsir. Soyuq adamı kəsir.* – [Sevər:] *Fəqət soyuq məni kəsmiş, dilim tutmur, danışdırmayın!* C.Cabbarlı. *Qışın dondurucu bir günü idi. Soyuq qılınc kimi kəsirdi.* A.Şaiq. *Sazaqlı bir sabah idi, yel adamı kəsirdi.* Çəmənzəminli.

6. Dayandırmaq, saxlamaq, son vermək, daha davam etdirməmək. [Nurəddin] *ağlamağını kəsib xəyala getmişdi.* S.S.Axundov. *Sarxan bir an üçün atəşi kəsdi.* M.Hüseyn. *Uşaq qorxusundan dərhal ufultusunu kəsdi.* Mir Cəlal. ◻ **Qabağını kəsmək** – qarşısına çıxmaq, getməyə qoymamaq, dayandırmaq. *Korun qabağını əliağaclı kəsməzlər.* (Ata. sözü). *..Dilənçi qabağımızı kəsib pul istədi.* M.S.Ordubadi.

7. Daha verməmək, məhrum etmək, istifadəsini dayandırmaq. *Qazı kəsmək. Suyu kəsmək. İşığı kəsmək. Telefonu kəsmək.*

8. Bir yeri tutub dayanmaq. *Qapını kəsib durmaq.* – *Şəhərin dərvişləri, dilənçiləri, seyid və mollaları tamamilə yolun sağını və solunu kəsmişdi*(*lər*). M.S.Ordubadi.

9. Ara vermək, dayanmaq, sakitləşmək. *Sulu qar kəsmişdi.* Ə.Əbülhəsən. *Axşamdan əsməyə başlayan külək sübhə yaxın birdən kəsdi.* Ə.Məmmədxanlı. // Sakitləşdirmək, dayandırmaq, nəhayət vermək. *Yüngül, sərin meh əsir; Yağmuru birdən kəsir.* A.Səhhət.

10. Örtmək, mane olmaq, qabağını tutmaq. *Enməyə başladı Boranlı dağı; Qayalıq, ağaclıq kəsmişdi yolu.* A.Şaiq. *Günəş qabağını kəsən buludlarla vuruşurdu.* S.Rəhimov.

11. Kəsici bir şeylə öldürmək. [Məhbuslar:] *Bir-bir kəsəcək, ağa dərviş, bizi Məstavər.* Ü.Hacıbəyov. – *Ay dayı, görəsən nə olar ona? – Kimə? – Bu, Hacını kəsən Osmana?* H.K.Sanılı.

12. Cəza təyin etmək, cəza vermək. *Tənbeh kəsmək. İş kəsmək.* – [İsmayıl:] *Kərimə yeddi il Sibir kəsdilər, göndərdilər getdi.* Ə.Haqverdiyev. *Cəfərqulu əvvəlcə güman etmişdi ki, .. ədalətlə işə baxıb bəyə qisas kəsəcəklər.* Qantəmir.

13. Qırmaq, doğramaq. [Kəndli:] *Ağa, mənim öz əlimlə əkib-becərdiyim badamlığı kəsirlər.* Mir Cəlal. // Ağacın, meynənin və s.-nin quru və artıq hissələrini qırmaq; budamaq. *Meynələri kəsmək.*

14. Hər hansı bir səbəbə görə tutmaq, saxlamaq, verməmək (əmək haqqının, maaşın bir hissəsini, ya hamısını). *Maaşını kəsmək.* // Qət etmək, üzmək (əlaqəni, münasibəti). *Nədənsə kəndlilər* [Hacı Sultanla] *alış-verişlərini kəsdilər.* S.Hüseyn.

15. Qəlibə tökmək və ya döyməklə hazırlamaq. *Kərpic kəsmək.* // Pul haqqında. *Pul kəsmək.*

16. Boyuna, bədəninə görə ölçüb biçmək. *Paltar kəsmək. Kostyum kəsmək.*

17. Çəpərləmək, hasarlamaq, ayırmaq, aranı hasar (barı, arakəsmə) ilə bölmək. *Otağı ortadan kəsmək.*

18. Bir işi görüb başa çatdırmaq, tamamlamaq. *Xana kəsmək. – Qərənfil xala corabların ikisinin də dabanını toxuyub kəsdi.* Ə.Vəliyev.

19. Oğurlamaq, yarmaq. *Ev kəsmək. – Bir gün lotubaşı dedi ki, gəlin gedək, padşahın xəzinəsini kəsək.* "Aşıq Qərib".

20. Qarşısını almaq, toxtatmaq, dayandırmaq. *Ağrını kəsmək. Əlinin qanını kəsmək. Qızdırmanı kinə kəsər.*

21. *məc. dan.* Ürəyindən keçmək, ürəyində sevmək, istəmək, meyli olmaq. *Yalan yoxdu, bir az səndən kəsirəm; O səbəbdən məhlənizdə əsirəm.* Aşıq Ələsgər. [Qarı:] *Olmaya baldızından kəsirsən? – dedi.* S.Rəhimov.

22. *məc. dan.* Ağır təsir etmək, çox toxunmaq, yandırmaq. *Bu söz məni kəsdi.*

23. *köhn.* Sünnət etmək. *Uşağı kəsmək.*

24. *dan.* Pis qiymət vermək (imtahanda və s.-də). *Tələbəni kəsmək. Ədəbiyyatdan kəsmək.*

25. Bir sıra isimlərlə birləşdirilərək, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: ayağını kəsmək, gözünü kəsmək, dil kəsmək, sözünü kəsmək, ətini kəsmək.

**kəsmə-kəsmə** *zərf* Aramla, qırıq-qırıq. *Bayaqdan qızışan Balaxanım kəsmə-kəsmə danışdı.* S.Rəhimov. *Cəmil əlindəki dəyənəyi yerə uzatdı, üzünü məruzəçi gəncə tutaraq kəsmə-kəsmə dedi.* Mir Cəlal.

**KƏSMƏŞİKƏSTƏ** *is. mus.* Azərbaycan xalq havalarından birinin adı. *Bütün şənlikdə* [Güləlioğluna] *bərabər kəsməşikəstə deyən tapılmazdı.* M.Hüseyn.

**KƏSMƏT** *is. məh.* Təqaüd, pensiya. *Kəsmət kəsmişdi sultan doqquz axça onunçün..* B.Vahabzadə.

**KƏSMİK** *is.* Südü qıcqırdaraq zərdabı çıxarılmaqla hazırlanan ağartı; axtarma.

**KƏSMİKLƏŞDİRİLMƏ** "Kəsmikləşdirilmək"dən *f.is.*

**KƏSMİKLƏŞDİRİLMƏK** *məch.* Kəsmik halına salınmaq (süd haqqında). *Süd kəsmikləşdirildi.*

**KƏSMİKLƏŞDİRMƏ** "Kəsmikləşdirmək"dən *f.is.*

**KƏSMİKLƏŞDİRMƏK** *icb.* Kəsmik halına saldırmaq, kəsmik etmək (südü). *Südü kəsmikləşdirmək.*

**KƏSMİKLƏŞMƏ** "Kəsmikləşmək"dən *f.is.*

**KƏSMİKLƏŞMƏK** *f.* Kəsmik halına düşmək. *Süd kəsmikləşdi.*

**KƏSR** *is.* [*ər.*] *riyaz.* Vahidin müəyyən hissəsini göstərən ədəd. *Adi kəsr. Onluq kəsr.*

**KƏSRƏ** *is.* [*ər.*] Ərəb əlifbasında "i" saitini əvəz edən və hərfin altında qoyulan "ـِ" işarəsinin adı; zir.

**KƏSRƏT** *is.* [*ər.*] Çoxluq. *Şəhərin havasının qəlizliyindən, tozundan, zəhmətinin kəsrətindən bir qədər asudələşmək və yorulmuş bədənimi köhnə halətinə gətirmək üçün kəndə rəvan oldum.* Ə.Haqverdiyev. *Münəvvər xanım kəsrəti-ələmdən bilməyirdi nə danışsın.* M.S.Ordubadi. *Gülzar eşq və həvəsin kəsrətindən özünü tamamilə itirib, bir əlini Fərhadın dizi üstə və bir əlini o biri tərəfə uzadıb yerə uzandı.* C.Cabbarlı.

**KƏSRƏTLİ** *sif.* Çox, çoxlu, bollu; saysız-hesabsız: *Qüvvətlidir Şərq əhli, həm kəsrətli; Saqın, qardaş, davran çox ehtiyatlı.* A.Səhhət.

**KƏSRİ** [*ər.*] b a x **kəsrli.**

**KƏSRLİ** *sif. riyaz.* Təkcə tamlardan ibarət olmayan, kəsri olan. *Kəsrli ədəd.*

**KƏSTANƏ** *is.* [əsli *yun.*] Şabalıd. [Xədicənin] *nəzər-diqqətini cəlb edən bir işi vardısa, o da həddindən fəzlə gur kəstanə rəngli saçları idi.* S.Hüseyn. [Muxtarla xanımı] *..yasəmən və kəstanə çiçəklərinin rayihəsi əhatə etdi.* Çəmənzəminli. ☐ **Kəstanə rəngi** – tünd-qəhvəyi (şabalıdı) rəng.

**KƏŞF** *is.* [*ər.*] 1. Əvvəlcə məlum olmayan bir şeyi tapıb meydana çıxarma. *İbtidai insanlar tərəfindən odun kəşfi. Amerikanın kəşfi. Yeni neft yataqlarının kəşfi.* – [Fərhadoğlu:] *Biz bu mədən sularının kəşfində böyük həyat mənası axtarırıq!* S.Rəhimov. *Geoloqlarımız ən dərin təbəqələrin kəşfi üçün lazımi tədqiqat aparırlar.* M.Hüseyn. // Tədqiqat, axtarışlar nəticəsində tapılmış, aşkara çıxarılmış şey. *Elmi kəşf. Texnika sahəsində yeni kəşf.* ☐ **Kəşf edilmək (olunmaq)** – "kəşf etmək"dən *məch. Kitabla kəşf edilir; Qiymətli dəfinələr.* M.Seyidzadə. *Kəşf edə bilməmiş alimlər bunu; İnsan varlığının ilk duyğusunu.* S.Vurğun. **Kəşf etmək** – tədqiqat, axtarışlar, müşahidələr nəticəsində tapmaq, aşkar etmək, meydana çıxartmaq, açmaq, müəyyən etmək. *Kəşf etdiyim zaman*

*bir yeni qaynaq; Sinəmdə çırpışan ləkəsiz ürək; Açılır gül kimi fərəhlənərək.* R.Rza. // *məc.* Bilmək, duymaq, hiss etmək, başa düşmək. *Dibi görünməyən ümman göstərin; Baş vurum; Kəşf edim dərinliyini.* B.Vahabzadə. **Kəşf qılmaq** *köhn.* – axtarıb tapmaq, müəyyən etmək. *Kərəmin Əsli ilə yaz vəslin; Kəşf qıl Əsli xanımın əslin.* S.Ə.Şirvani. **Kəşf olmaq** – aşkar olmaq, açılmaq, məlum olmaq. *Heç fayidəbəxş olmadı tədbirlərim, heyf! Kəşf oldu bütün aləmə təqsirlərim, heyf!* M.Ə.Sabir.

2. Kəşfiyyat. *Kəşfə göndərdiyim adamlar qayıdıb Laçının dediklərinin doğru olduqlarını söylədilər.* H.Nəzərli.

**KƏŞFİYYAT** *is.* [*ər.* "kəşf" söz. cəmi] 1. Hər hansı bir məlumat əldə etmək məqsədilə aparılan tədqiq, ya yoxlama işləri. *Faydalı qazıntılar kəşfiyyatı. Neft kəşfiyyatı.* – [Sadıqzadə:] *Bax, bütün bu arada buruqlar qoyulacaq, kəşfiyyat işləri başlanacaq, Turşsu, İstisu, başqa-başqa şəfa qaynaqlarının bitib-tükənməz mənbələri elmi əsaslar üzrə öyréniləcəkdir.* S.Rəhimov. [İnşaatçılar "Gəmilər ada"sında] *ilk kəşfiyyat quyusunu qazacaq adamlar üçün baza yaratmağa – dəmir sütunlar üzərində bir ev tikməyə gəlmişdilər.* Ə.Sadıq.

2. Düşmənin yerini və qüvvəsini müəyyən etmək üçün əsgəri qrup tərəfindən aparılan əməliyyat. *İldırım kəşfiyyatdan qayıdanda, hər gecə; Qoltuğundan bir şəkil çıxarırdı gizlicə.* S.Rüstəm. *Cavadın qabaqcadan göndərdiyi kəşfiyyat dəstəsi bu top hazırlığının gurultusu altında düşmən cərgələrinə yaxınlaşmışdı.* Ə.Vəliyev.

3. Başqa dövlətlərin iqtisadi və siyasi durumu, onların silahlı qüvvələrinin vəziyyəti haqqında məlumat əldə etmək məqsədilə xüsusi dövlət orqanları tərəfindən həyata keçirilən tədbirlərin məcmusu, bu cür məlumat toplamaqla məşğul olan adamlar, təşkilat. *Kəşfiyyat orqanları.*

**KƏŞFİYYATÇI** *is.* 1. Kəşfiyyata göndərilmiş, kəşfiyyatda olan hərbi qulluqçu (b a x **kəşfiyyat** 2-ci mənada). *Saday hissənin ən məşhur kəşfiyyatçılarından biri sayılırdı.* M.Hüseyn. *Vəziyyətdən aydın idi ki, Orucov alman kəşfiyyatçısı ilə tutaşmışdır.* Mir Cəlal.

2. Kəşfiyyat işçisi, agenti (b a x **kəşfiyyat** 3-cü mənada). *Düşmən kəşfiyyatçısı.*

3. Kəşfiyyatla məşğul olan adam (b a x **kəşfiyyat** 1-ci mənada). *Qasid Nərcə kəndinin yanından keçərkən, Fəxrəddinin ordusundan göndərilən kəşfiyyatçılardan Dəmirə rast gəldi.* M.S.Ordubadi.

**KƏŞFİYYATÇILIQ** *is.* Kəşfiyyatçının işi, sənəti. *Teymur müəllim .. öz maraqlı hekayələri ilə şagirdlərin qəlbində səyyahlığa, kəşfiyyatçılığa böyük həvəs oyatmışdır.* Ə.Sadıq.

**KƏŞKÜL** *is.* [*fars.*] *köhn.* Hind qozunun qabığından qayrılıb dərviş və qələndərlərin əllərində gəzdirdikləri və dilləndikləri şeyləri içinə qoyduqları qab. *Nökər isə dərvişə yaxınlaşıb bir tümən onun kəşkülünə atdı.* M.S.Ordubadi. *Boynundan bir çox kiçik və iri muncuqlar asmış bir dərviş .. kəşkülünü yoldan keçən adamlara tərəf uzadıb pul istədi.* A.Şaiq. [Dərviş Yədulla] *sonra xırmanın içinə yeriyib Hətəmxana tərəf kəşkülünü uzatdı.* S.Rəhimov.

**KƏŞMİR(İ)** b a x **kişmir(i).** *..Artırır zər, tafta, tül o cəlalı; Zəri, tirmə, atlas, həm kəşmir şalı.* Şəhriyar.

**KƏTAN** *is.* [*ər.*] 1. Saplağından toxunmaya yarar lif, toxumlarından isə yağ əldə edilən ot-bitki. *Kətan əkini. Kətan tarlası. Yabanı kətan. Kətan toxumu. Kətan cecəsi.* – *Mənsiz kətan, kəndir verməz zəmilər; Çadırsız, yelkənsiz qalar gəmilər.* A.Səhhət. // Bu bitki liflərindən hazırlanan parça. *Kətan köynək. Kətan döşəkağı. Kətan dəsmal.* – [Mirzənin] *kiçik oğlu qardaşının əmrlərinə itaət edirdi: əczaxanaya getmək, həkim yanına yüyürmək, kətan islatmaq və sairə.* Ə.Haqverdiyev. [Ana] *qızının çarpayısı üzərinə əyilib alnındakı yaş kətanı düzəldirdi.* M.Hüseyn.

**KƏTANÇI** *is* Kətan əkib becərməklə məşğul olan adam.

**KƏTANÇILIQ** *is.* Kətan əkib becərmə işi.

**KƏTƏ** *is.* I. Göyərti qutabı. [Mahmud:] *Bir kətəyə bax, şit yağı da basıblar arasına, adamın ağzının suyu axır.* Ə.Haqverdiyev. [Qarı:] *Anam mənə dedi ki, qızım, səhərdən dur, üzünü yu, adla o taydakı bulaq başından pencər yığ gətir, kətə salaq.* S.Rəhimov.

**KƏTƏBƏ** b a x **kitabə.** [Mirzə] *çinilər ilə müzəyyən, divarlarında əlvan kətəbələr asılmış .. bir otağa daxil oldu.* Çəmənzəminli.

**KƏTƏMƏZ** *is*. Yeni doğmuş heyvanın ilk südündən bişirilmiş yemək.

2. Xəmirinə süd, şəkər, yumurta, yağ qatılaraq bişirilən girdə şirin çörək.

**KƏTXUDA** *is. tar.* Keçmişdə Azərbaycan kəndlərində əhali tərəfindən seçilən və kəndin inzibati işlərini idarə edən şəxs. [Atlıların başçısı ev sahibinə:] *Zəncandan gəlirik, ey kətxuda, yolda yubandıq. Dağlarda çovğundur. İzin ver, bu gecəni sənin kəndində, sənin evində qalaq.* Ə.Məmmədxanlı.

**KƏTXUDALIQ** *is.* Kətxudalıq vəzifəsi, işi.

**KƏTİL** *is.* 1. Söykənəcəyi olmayan sadə stul, kürsü; taburet. ..*Şərəfoğlu ağ kətili taxtın yanına çəkib, əlini Rüstəm kişinin başına qoydu.* M.İbrahimov. *Bucaqda yükün bir tərəfində paltar-palaz, qab-qacaq, o biri tərəfində kətil üstündə radio cihazı qoyulmuşdu.* R.Rza. *Qapının qabağında, kiçik bir kətilin üstündə bir arvadın oturub çubuq çəkdiyini gördü.* S.Rəhman.

2. Divar hörgüsündə daş və ya kərpiclər arasına, yaxud pəncərə divarlarının üstünə qoyulan dirək parçası, ağac.

**KƏTMƏN** *is.* Alaq vurmaq, torpağı yumşaltmaq üçün kənd təsərrüfatı aləti. *Qızlar, gəlinlər də çiynində kətmən; Deyib gülə-gülə dağıldı çölə.* S.Vurğun. *Qışın şaxtasında, boranında, yayın göydən od ələyən uzun günlərində bu qızlar kətməni, beli əllərindən buraxmadılar.* Ə.Əbülhəsən. ☐ **Kətmən vurmaq** – kətmənlə işləmək. *Heç kim* [Gülşənlə] *kətmən vura bilməzdi.* Ə.Vəliyev.

**KƏTMƏNÇİ** *sif.* Kətmənlə işləyən adam, qadın. *Kətmənçi dəstəsi.*

**KƏTMƏNLƏMƏ** "Kətmənləmək"dən *f.is.* ..*Pambığın yavaş-yavaş çiçək açmasına baxmayaraq, hələ kətmənləmə qurtarmamışdı.* İ.Şıxlı.

**KƏTMƏNLƏMƏK** *f.* Kətmənlə alağı təmizləmək, yaxud kəsəkləri xırdalamaq, torpağı yumşaltmaq. *Sahəni kətmənləmək.*

**KƏTMƏNLƏNMƏ** "Kətmənlənmək"dən *f.is.*

**KƏTMƏNLƏNMƏK** *məch.* Kətmənlə vurulmaq (alaq), yumşaldılmaq (torpaq).

**KƏTMƏNLƏTDİRMƏ** "Kətmənlətdirmək"dən *f.is.*

**KƏTMƏNLƏTDİRMƏK** bax **kətmənlətmək.**

**KƏTMƏNLƏTMƏ** "Kətmənlətmək"dən *f.is.*

**KƏTMƏNLƏTMƏK** *icb.* Kətmənlə alağı vurdurmaq, torpağı yumşaltdırmaq.

**KƏVAKİB** [*ər.* "kövkəb" söz cəmi] *klas.* Ulduzlar. *Zülmət ziyayə oldu qalib; Yandırdı məşailin kəvakib.* Füzuli. *Bütün kəvakibi bir-bir öz adları ilə sayırlar; Ki, seyr edir hərəsi hər zaman bu boyda, bu boyda.* M.Ə.Sabir.

**KƏVƏLƏ** *is. zool.* Bataqlıqda yaşayan uzundimdik quş.

**KƏVƏR** *is. bot.* Nazik, uzun yarpaqlı, yeyilən və xörəyə qatılan acıtəhər göyərti. *Dovğaya kəvər qatmaq. İki dəstə kəvər. – Ənvər ləzzətli dolmanı iştaha ilə yeyir, kəvərdən, turpdan tez-tez götürüb ağzına qoyurdu.* Ə.Vəliyev.

**KƏYAN** *is.* [*fars.*] *klas.* İran şahlarına verilən ümumi ad. [Nüşabə:] *Bu kəyan bayrağı, bu da bir tuğra; Keyqubad möhrü də vurulmuş bura.* A.Şaiq.

**KƏZZAB** *is.* [*ər.*] *köhn*. Yalançı, yalan danışan.

**KIRIXMA** "Kırıxmaq"dan *f.is.*

**KIRIXMAQ** bax **karıxmaq.** *Ya nə vicdanə digər bir işə çulğaşdı yetim; Hərə bir hoqqa çıxartdız, kırıxıb çaşdı yetim.* M.Ə.Sabir. *Sənin kimi mən də bir az kırıxdım.* R.Rza.

**Kİ**[1] *bağl.* 1. Baş cümlə ilə budaq cümlələri bir-birinə bağlayır. *Elə yavaş danışır ki, eşitmək olmur. Elə dumandır ki, göz gözü görmür. – Səkinə yaxşı bilirdi ki, son zamanlar qızının .. nəbzi əvvəlkilər kimi vurmur.* M.İbrahimov. *Orasını da deməliyik ki, Murad Bayramın üstünə yaman düşmüşdü.* Ə.Vəliyev.

2. Bağlayıcı vəzifəsini görən bir sıra sözlərə (ki, necə, hansı, niyə və s.) qoşularaq, onlarla sonrakı sözlər arasında əlaqəni daha da qüvvətləndirir. *Necə ki, dedim. Kim ki, cavab verdi...*

3. Bəzi modal sözlərdən (yəqin, görünür, əlbəttə, gərək, guya və s.) sonra gələrək, ehtimallıq, zərurilik və gerçəklik məzmununun cümlələrin ikinci hissəsinə keçməsi üçün şərait yaradır. *Yəqin ki, mənim qarama hirslənib getdiniz.* İ.Əfəndiyev. *Gərək ki, məktəbdən gəlmişdi.* Mir Cəlal.

4. Feldən sonra gələrək, başqasının nitqini ifadə etməyə xidmət edir. *Bir dəfə Güllü*

*mənə demişdi ki, qızım, sənin bu dünyada bir xoşbəxtliyin var..* İ.Əfəndiyev.

5. Ədatlardan sonra işlənərək, ədatla birlikdə cümləni və ya onun müəyyən hissəsini qüvvətləndirməyə xidmət edir. *İndi ki bu mənim pulumu görüb, bu qədər əziyyətə düçar olub, belə adamlar vəfalı olarlar.* (Nağıl). *İndi ki sən xahiş edirsən, qızın pulunu keçərəm.* Mir Cəlal.

6. Müxtəlif sözlərdən sonra gələrək həmin sözlərin mənasını qüvvətləndirir. *Yaxşı ki dəvət etmişik. – Bu ki mənim əlimdə su içmək kimi bir şeydi.* (Nağıl). *Mən ki damdan, bacadan baxmaz idim; Su kimi hər tərəfə axmaz idim.* M.Ə.Sabir.

7. Sadə bağlayıcı, qoşma, ədat, feli bağlama, işarə əvəzliyi və s.-dən sonra gələrək, mürəkkəb bağlayıcı əmələ gətirir; məs.: ancaq ki, ona görə ki, yaxud ki, bunun üçün ki, indi ki, odur ki.

**Kİ²** Aşağıdakı mənalarda və hallarda işlədilən ədat.

1. Sual cümlələrinin sonunda gələrək, xəbərə aid olur, xəbərin və ya ümumiyyətlə, cümlənin mənasındakı sualı qüvvətləndirir. *Ay Xanpəri, daha biz niyə dayanmışıq ki?* M.Hüseyn. *Burada təəccüblü nə var ki?* S.Rəhimov. *Ay bala, bir yerin ağrımır ki?* Mir Cəlal.

2. Əvəzliklərdən sonra gələrək, onu başqa sözlərdən fərqləndirir, daha çox nəzərə çarpdırır. [Fuad:] *Sən ki mənim nişanlımsan?* C.Cabbarlı. *Bunu ki bizlərdə hamı bilir.* S.Rəhimov. *O ki yaxşı adamdır, usta!* Mir Cəlal.

3. Cümlənin sonunda etiraz məqamında işlədilir. *Bu olmadı ki.* M.S.Ordubadi. *Mən uşaq-zad deyiləm ki.* M.Hüseyn.

4. Əsasən cümlələrin sonunda kinayə məqamında işlədilir. *Bizlərdə südü stəkanla içməzlər. Bura şəhər-zad deyil ki.* M.Hüseyn. *Hamı bu cür ola bilməz ki.* Ə.Vəliyev.

5. Gözlənilməz bir hadisə baş verdiyi zaman əmələ gəlmiş vəziyyəti bildirmə məqamında işlədilir. *Kişi yenə də məni yaxaladı ki...* S.Rəhimov. [Sadıq:] *Ay aman, bu da gəlib çıxdı ki...* S.Rəhman.

6. Kinayə, istehza və ya etiraf məqamında işlədilir. *O lap uşaqdır ki.* – [Salmanov:] *Gəlsin, ondan qorxmuram ki.* S.Rəhman.

**KİBERNETİKA** *is.* [*yun.*] İdarə sistemləri, üsul və vasitələri haqqında elm.

**KİBR** *is.* [*ər.*] Özünü hamıdan üstün tutma, başqalarına yüksəkdən baxma; lovğalıq, məğrurluq; lovğalanma, qürurlanma, təşəxxüs. *Nazı çox, qəmzəsi bol, kibri də var dilbərimin.* Ə.Nəzmi. *Kibridən qəlbində bərkitmə barı; Top dəyər, dağılar bürcü, hasarı.* Aşıq Ələsgər.

**kibrlə** *zərf* Lovğalıqla, lovğa-lovğa, qürurla. *Kibrlə danışmaq. Kibrlə gülmək. – Bünyad başqa vaxt olsaydı .. kibrlə susub durmazdı.* Ə.Əbülhəsən. *..Şah kibrlə gülümsədi.* İ.Əfəndiyev.

**KİBRİT** *is.* [*ər.*] Od almaq üçün ucunda kükürd olan nazik çubuq. *Kibrit qutusu. – Azad kibrit işığında onun sarı bənizini, tutqun firuzə gözlərini, hətta üzündəki çilləri bulaşıq bir şəkildə zor-güc seçə bildi.* A.Şaiq. *Uzaqda alışan bir kibritin də; Qoxusu burnunda duyulacaqdır.* M.Araz. ☐ **Kibrit çəkmək** – ucu kükürdlü kibrit çubuğunu bir şeyə çəkib alışdırmaq. *Əhməd qapıya yaxınlaşdı. İtələyib taybatay açdı. Kibrit çəkib çırağı yandırdı.* İ.Şıxlı.

**KİBRİTQABI** *is.* Kibrit çöpləri qoyulan balaca qutu. // Həmin qutunun üstünə geydirilən metal və s. materialdan qapaq.

**KİBRLƏNMƏ** "Kibrlənmək"dən *f.is.*

**KİBRLƏNMƏK** *f.* Kibrli olmaq; lovğalanmaq, təşəxxüslənmək.

**KİBRLİ** *sif.* Lovğa, təşəxxüslü. [Zabit] *nəzərini Şirəlinin dodaqlarından ayırıb kibrli bir hal aldı.* M.Hüseyn. [Qoca həkimin] *təbəssümündəki acı və kibrli hal gənc qadını titrətdi.* İ.Əfəndiyev.

**KİBRLİLİK** *is.* Kibrli adamın hal və keyfiyyəti; lovğalıq, məğrurluq, təşəxxüslük.

**KİCƏMƏ** "Kicəmək"dən *f.is.*

**KİCƏMƏK** *f.* Öcəşmək, sataşmaq. [Məşədi İmamqulu:] *Ədə, bəlkə darvazanın qabağında uşaqlarla kicədin, orada düşdü?* Çəmənzəminli.

**KİÇİCİK** *sif.* Olduqca kiçik, çox kiçik. *Kiçicik otaq. Kiçicik qab. Kiçicik qutu. – Gülzar kiçicik əllərini irəli uzatmış, həyəcan içində nəticəni gözləyirdi.* C.Cabbarlı. *Bu bülbül kiçicik vücudunu sarsıdan, hər nəfəsində ürəyinin bir parçacığı qopurmuş kimi*

*yanıqlı hıçqırıqlarla dolu nağməsi ilə nə deyirdi?* M.Rzaquluzadə.

**KİÇİK** *sif.* 1. Həcmcə, ölçücə balaca; xırda (*böyük* müqabili). *Kiçik əl. Kiçik göz. Kiçik otaq. Kiçik qab. Kiçik kitab. – Qapıçı kiçik pəncərədən* [Nəbinin] *nə istədiyini xəbər alır.* "Qaçaq Nəbi". *Kiçik və yoxsul daxmasının səkisi üzərində ortaboylu, sağlam, yaşlı bir adam oturmuşdu.* A.Şaiq.

2. Kəmiyyətcə, sayca, miqdarca çox olmayan; az. *Kiçik bölmə. Kiçik dəstə. – Beləliklə, tikintidə kiçik bir özfəaliyyət dərnəyi yarandı.* İ.Əfəndiyev.

3. Azyaşlı, balaca. *Evin kiçik uşağı. – Anaxanım kiçik balasını öz ana qanadları altına alıb böyütməyə başladı.* A.Şaiq. *Pəncərəm önündən hər səhər tezdən; Məktəbə gedirsən, a kiçik dostum!* N.Rəfibəyli. // Yaşca o birindən balaca olan. *Kiçik bacı. Kiçik qardaş. – İki gündən sonra Səfərin anasına sifariş göndərdilər ki, böyük qız ərə getməyincə kiçik qızı atası heç kəsə verməyəcək...* Ə.Haqverdiyev. *Qoçaq və işgüzar qızlardan olduğuna* [görə] *qayınatası Mələkdən əl çəkməyib on üç yaşında kiçik oğluna nikah etdi.* A.Divanbəyoğlu. // İs. mənasında. *Böyüklə böyükdür, kiçiklə kiçik.* (Məsəl). *Pəncərədə üzüm var; Ana, sənə sözüm var; Qonşu oğlanlarının; Kiçiyində gözüm var.* (Bayatı). *Kiçiklər böyüklərin dalınca gəzir; Və həmişə başıaşağı.* R.Rza. *Elə bir zamandan danışıram ki, böyüklərin xatirəsində çox yaxşı qalıb, kiçiklərin isə ağlına gəlməz.* S.Rəhman. □ **Kiçikdən böyüyə qədər** – yaşdan asılı olmayaraq; hamı. *Kiçikdən böyüyə qədər bütün ailə toya gəlmişdi.*

4. *məc.* Əhəmiyyətsiz, cüzi, yüngülvari. *Kiçik bir hadisə. Kiçik bir mübahisə. Kiçik bir məsələ. –* [Firidun:] *Kiçik bir xata böyük bəlalar törədir.* M.İbrahimov. *Qoca mürəttib kiçik bir işarəyə bənddi.* M.Hüseyn.

5. Vəzifəcə, rütbəcə, dərəcəcə aşağı. *Kiçik elmi işçi. Kiçik zabit. – Bizim aramızda Şuşa istirahət evlərindən qayıdan işçi və kolxozçular olduğu kimi, yeddi-səkkiz nəfər gənc tələbə, bir nəfər də kiçik komandir vardı.* S.Hüseyn. // İs. mənasında. *Kiçiklərin böyüməsi çətin işdi; "Böyüklərin" kiçilməsi; çox asandı.* M.Araz.

**KİÇİKCƏ** *sif.* Çox kiçik, yaxud bir qədər kiçik. *Məhlədə bitər söyüd; Yarpağı gömgöy söyüt; Kiçikcə bir yar sevdim; Xudam, sən özün böyüt.* (Bayatı).

**KİÇİKCİK** b a x **kiçicik.** [Müqim bəy:] *Gəl, mirzə, .. aramızdakı hər hansı kiçikcik ixtilafı bir kənara buraxıb qardaş olaq.* S.Rəhimov.

**KİÇİKLƏNMƏ** "Kiçiklənmək"dən *f.is.*

**KİÇİKLƏNMƏK** *f.* Yaltaqlıq etmək, yaltaqlanmaq, başqalarının qarşısında əyilmək, əskilmək.

**KİÇİKLƏŞMƏ** "Kiçikləşmək"dən *f.is.*

**KİÇİKLƏŞMƏK** *f.* Kiçik olmaq, kiçilmək.

**KİÇİKLİ-BÖYÜKLÜ** *is.* Hamı, hamısı.

**KİÇİKLİK** *is.* 1. Həcmcə, ölçücə balacalıq, xırdalıq. *Otağın kiçikliyi. Tarlanın kiçikliyi.*

2. Kəmiyyətcə, sayca, miqdarca, cüzilik, azlıq. *Dəstənin kiçikliyi. Dərnəyin kiçikliyi.*

3. Yaşı az olma; azyaşlılıq, balacalıq. *Kiçikliyinə baxma, çox zirəkdir.* // **Kiçiklikdən** şəklində – balacalıqdan, uşaqlıqdan. [Əzim dayının] *uca bir budaqdan digər bir budağa sürətlə elə atılışı var idi ki, bu cürət və çevikliyi ancaq ta kiçiklikdən idman görmüş .. uşaqlarda görmək olur.* A.Şaiq.

4. *məc.* Əhəmiyyətsizlik, cüzilik, yüngülvarilik. *Məsələnin kiçikliyi.*

5. Vəzifəcə, rütbəcə aşağı olma. *Vəzifənin kiçikliyi.*

◊ **Kiçiklik etmək** – özünü aşağı tutmaq, böyüyə hörmət etmək, ehtiram göstərmək. **Kiçikliyində qalmaq** – b a x **kiçiklik etmək.** [Nəsir] *..öz kiçikliyində* (qalır), *ehtiramını yenə əvvəlki kimi saxlayırdı.* S.Hüseyn.

**KİÇİKRAQ** *müq. dər. köhn.* Bir qədər kiçik.

**KİÇİKTƏHƏR** b a x **kiçikraq.**

**KİÇİKYAŞLI** *sif.* Yaşı az, uşaq yaşlarında olan; uşaq. *Kiçikyaşlı uşaqlar. –* [Cəfər əmi] *dünyada hər şeydən artıq iki vücudu sevər və xidmət edərdi: kiçikyaşlı qızı Yemənciyi, bir də qırğısını.* H.Nəzərli. *Məktəbdə kiçikyaşlı uşaqların konserti idi.* Mir Cəlal.

**KİÇİLDİCİ** *sif.* Görünən şeylərin şəkillərini kiçildən. *Kiçildici şüşə.*

**KİÇİLDİLMƏ** "Kiçildilmək"dən *f.is.*

**KİÇİLDİLMƏK** *məch.* Kiçik edilmək; balacalandırılmaq.

**KİÇİLƏN** *f.sif. riyaz.* Sonsuz miqdarda çıxılan rəqəm; azalan.

**KİÇİLMƏ** "Kiçilmək"dən *f.is.*

**KİÇİLMƏK** *f.* 1. Həcmcə, miqdarca, ölçücə daha kiçik olmaq; azalmaq, balacalaşmaq, xırdalanmaq. *..Başın çanağı nazikləşib kiçildikcə beyin də zəifləməyə və kiçilməyə başlayır.* C.Məmmədquluzadə. // Getdikcə kiçik görünmək, balacalaşmaq. *Müəllim uzaqlaşdıqca kiçilir, kiçildikcə fərq edilməyəcək bir hal alırdı.* S.Hüseyn. *Çox keçmədi* [Bəndalı] *bir nöqtə kimi kiçildi, gözdən itdi.* Mir Cəlal. *Gedir, gedir, nəhayət; Kiçilir bir xal kimi.* M.Rahim.

2. *məc.* Vəzifəcə, rütbəcə alçalmaq; hörmətdən, nüfuzdan düşmək. [Xacə Nizam:] *Sən kiçilsən də, böyüsən də; Hətta qopsa zülmət; Yenə parlar o zəka!..* H.Cavid.

3. *məc.* Yaltaqlanmaq, özünü alçaltmaq, alçalmaq. *O, divanxanada hər kəsə kiçilir, hər kəsin üzünə gülür..* H.Nəzərli.

**KİÇİLTMƏ** 1. "Kiçiltmək"dən *f.is.*

2. Qrammatikada: isimlərdə şeylərin həcm etibarı ilə kiçilməsini və sifətlərdə keyfiyyətcə azlığı göstərən. *Kiçiltmə şəkilçiləri. Kiçiltmə dərəcəsi.*

**KİÇİLTMƏK** *f.* 1. Balacalatmaq, daha kiçik etmək, azaltmaq, ixtisar etmək (miqdarca, sayca, həcmcə və s.).

2. Vəzifəcə aşağı salmaq. *Amma birdən çıxarsalar işdən səni; Kiçiltsələr vəzifəni; Səni yolda görsə belə; Əsla nəzər salmayacaq.* Z.Xəlil.

3. *məc.* Hörmətdən salmaq; alçaltmaq. *Hansı bir yazıçı olur olsun, nə onu qərəzkarlıqla kiçiltmək, nə də qəsdən şişirdib böyütmək olmaz.* S.Rəhimov.

**KİF** *is.* Çürüyən və ya nəm şeylərin üstündə nazik qat şəklində əmələ gələn yüngül, yumşaq mikroskopik göbələkciklər. *Qoca gözlərini açanda özünü .. kif qoxuyan bir zirzəmidə gördü.* M.Rzaquluzadə. ☐ 1) **Kif atmaq (bağlamaq, basmaq, tutmaq)** – üstü kiflə örtülmək, kiflənmək. *Çörək kif atıb. Sirkəni kif basıb;* 2) b a x **kiflənmək** 2-ci mənada.

**KİFAYƏT** *zərf* [*ər.*] 1. Yetər, kafi, bəs olma. *Deyirlər, çox ardır yüz il, əlli il; İnsana bir ömür kifayət deyil.* B.Vahabzadə. ☐ **Kifayət qədər** – lazımınca, lazımi qədər, bəs olduqca. [*Qurban*] *yolda yeriyərkən düşünürdü: – Xoşbəxt adam, kifayət qədər pul toplamış, indi də gedib uşaqlarına qovuşacaqdır.* A.Şaiq. [Tahir] *ikiotaqlı təzə mənzilində cəmisi bir həftə qalmışdı, hələ də buraya kifayət qədər isinişməmişdi.* M.Hüseyn. *Sultan ciddi nüfuzedici bir ahənglə, özü də kifayət qədər məntiqlə danışırdı.* İ.Hüseynov. **Kifayət etmək** – 1) b a x **kifayətlənmək.** *Mirzə öz maaşına kifayət edib bir qəpik də olsun rüşvət almazdı.* Ə.Haqverdiyev; 2) çatmaq, yetmək, bəs olmaq. *Şərt deyildir yatıbduram yanında; Gendən baxmaq mənə kifayət eylər.* M.P.Vaqif. [Bədircahan:] *..Dəxi mənə artıq şey lazım deyil, bir beş-altı manat kifayət edər.* N.Vəzirov. **Kifayətə yetmək** *köhn.* – razı düşmək, təmin olunmaq, kifayətlənmək. [Sitarə:] *Bu çərxdən gərək yetə hər kəs kifayətə.* C.Cabbarlı. **Kifayət olmaq** – b a x **kifayət etmək** 2-ci mənada.

2. **Kifayətdir** (şəklində) – yetər, çatar, bəsdir. [Aslan bəy:] *Bircə yaylım atılarsa, kifayətdir..* C.Cabbarlı. *Bir könülə kifayətdir bir mənalı məhəbbət; İki qəlbi əyləndirmək xəyanətdir, sevgilim!* S.Rüstəm. // Əmr mənasında – yetər! bəsdir! kifayət edər! *Kifayətdir, buraxın söhbəti!*

**KİFAYƏTLƏNDİRİCİ** *sif.* Kifayət qədər yaxşı verilən tələblərə cavab verən; kafi. // Kifayətləndirək razı edən, təmin edən; qaneedici. *Kifayətləndirici cavab.*

**KİFAYƏTLƏNDİRMƏ** "Kifayətləndirmək"dən. *f.is.*

**KİFAYƏTLƏNDİRMƏK** *f.* Razı salmaq, qane etmək, təmin etmək.

**KİFAYƏTLƏNMƏ** "Kifayətlənmək"dən *f.is.*

**KİFAYƏTLƏNMƏK** *f.* 1. Özünü təmin olunmuş hesab etmək, razı qalmaq, qane olmaq; qənaətlənmək. *Bu cavabla kifayətlənmək olar.*

2. Müəyyən bir çərçivədə qalmaq, bir şeyi kafi hesab etmək. *Bir töhmətlə kifayətlənmək olar.* – [Rəsul] *gördü ki, bu zalımlar udduqları pullarla kifayətlənməyib, üstəlik yatdıqları yorğan-döşək və balışları da aparmışlar.* "Aşıq Qərib". *Ancaq Cəmilə, yalnız* [Mirzəğanın] *üzünə gülümsəməklə kifayətləndi.* S.Hüseyn.

**KİFAYƏTSİZ** *sif.* Ehtiyacı ödəməyən, çatışmayan, kifayət etməyən.

**KİFAYƏTSİZLİK** *is.* Ehtiyacı ödəməmə, çatışmama, kifayət etməmə.

**KİFİR** *sif.* 1. Çirkin, eybəcər. *Kifir qadın. Kifir uşaq.* – [Sənəm:] *Nə kifir kişidir, ay Allah!* Ü.Hacıbəyov. [Qumru:] *Bəy olanda nə olar, başıbatmış nə qədər də kifirdir.* Mir Cəlal.

2. *məc.* Pozğun, yaramaz, ləyaqətsiz, murdar.

**KİFİRLƏNMƏ** "Kifirlənmək"dən *f.is.*

**KİFİRLƏNMƏK** b a x **kifirləşmək.**

**KİFİRLƏŞMƏ** "Kifirləşmək"dən *f.is.*

**KİFİRLƏŞMƏK** *f.* Gözəlliyini itirmək, eybəcərləşmək, çirkinləşmək. *Qız böyüdükcə kifirləşirdi.*

**KİFİRLİK** *is.* Eybəcərlik, çirkinlik. *Üzündən, gözündən kifirlik daşır; Deyəsən, qəlbində qurdlar oynaşır.* S.Vurğun [Ələkbər:] *Yox canım, Qumru hara, belə kifirlik, neybətlik hara!* Mir Cəlal.

**KİFLƏNMƏ** "Kiflənmək"dən *f.is.*

**KİFLƏNMƏK** *f.* 1. Üzü kiflə örtülmək, kif atmaq, kif bağlamaq. *Qərənfil xala Camal əmiyə dörd iri fətir uzadaraq: – Bunları tək-tək qoy, çünki çim süddə yoğurmuşam, kiflənə bilər.* Ə.Vəliyev.

2. *məc.* Uzun müddət bir yerdə qalmaq, xarab olmaq, inkişafdan qalmaq.

**KİFLƏNMİŞ** *f.sif.* Kif bağlamış, kif basmış, kifdən xarab olmuş. *Kiflənmiş çörək. Kiflənmiş pendir. – Rütubətli, kiflənmiş qaranlıq otaqda tavandan tökülən damcıların səsi eşidilirdi.* Ə.Əbülhəsən.

**KİFLƏTMƏ** "Kiflətmək"dən *f.is.*

**KİFLƏTMƏK** *t-li.* Kiflənməsinə səbəb olmaq, kifləyib xarab etmək.

**KİFLİ** *sif.* Kifi olan, kif iyi verən, kif bağlanmış. [Sayalının] *..kifli, üfunətli düyünçələrində .. nə desən tapılardı.* Mir Cəlal.

**KİFSİMƏ** "Kifsimək"dən *f.is.*

**KİFSİMƏK** b a x **kiflənmək.** *Belə vaxtlarda idarənin pəncərələri açılır, kifsimiş kağız qoxusu küçəyə yayılırdı.* Mir Cəlal.

**KİFSİNMƏ** "Kifsinmək"dən *f.is.*

**KİFSİNMƏK** b a x **kiflənmək.**

**KİFT** *is.* [*fars.*] *köhn.* Sifilis. *Bir çox söhbətdən sonra məlum olur ki, Məşədi Allahverən bir vaxt kift azarına mübtəla olubmuş.* N.Nərimanov.

**KİLƏ** *is.* 1. Altı kiloqrama bərabər köhnə ağırlıq ölçüsü. *İki kilə arpa.*

2. İkigözlü taxta tərəzi.

**KİLİD** *is.* [*fars.*] 1. Qıfıl. *Asma kilid. – Siyirmə kilidlər biləkdən yoğun; Asılmış qıfıllar buğunbəbuğun.* H.K.Sanılı. *Dağa çıxaq, düzə enək, göyə dırmanaq; Yolumuzun kilidi bir, açarı birdir.* M.Araz.

2. Qapını bağlamaq üçün dalına keçirilən uzun dəmir və ya ağac parçası.

**KİLİDLƏMƏ** 1. "Kilidləmək"dən *f.is.*

2. B a x **qıfılbənd** 2-ci mənada. [Muzdur] *saz çalmasa da, çalğı tanıyan, havacatdan, gözəlləmədən, kilidləmədən, deyişmədən başı çıxan bir oğlandı.* Ə.Əbülhəsən.

**KİLİDLƏMƏK** *f.* Kilidlə bağlamaq. *Əmiraslan .. Nurəddini çomaq ilə döyüb anbara saldı və ağzını kilidləyib getdi.* S.S.Axundov. *Məşədibəy birdən qalxıb kabinetinin qapısını kilidlədi.* M.Hüseyn. *Şəkər qapını tez kilidləyib həkimin arxasınca getdi.* B.Bayramov.

**KİLİDLƏNMƏ** "Kilidlənmək"dən *f.is.*

**KİLİDLƏNMƏK** *məch.* 1. Kilid vurulmaq, kilidlə bağlanmaq. *Qapı kilidlənmişdi. – Evin qapısı dışarıdan kilidlənmişdi.* M.Hüseyn.

2. *məc.* Bərk, möhkəm qapanmaq; açılmamaq. *Göz qapaqları kilidlənmək.* – ..[Mehribanın] *dişləri kilidlənmiş, əl-ayağı quruyub əsdiyi halda qorxunc və vəhşi bir səslə çığırırdı.* S.Hüseyn. *İdrak da boğular, söz də, sənət də; Ağıl kilidlənər dildə, dodaqda; Azadlıq olmayan bir məmləkətdə; Nadan başda gəzər, aqil ayaqda.* B.Vahabzadə.

3. *məc.* Bağlanmaq, tutulmaq. *Qurtuluş yolları kilidləndi bax...* R.Rza.

**KİLİDLƏTMƏ** "Kilidlətmək"dən *f.is.*

**KİLİDLƏTMƏK** *icb.* Kilidlə bağlatmaq. *Qapıları kilidlətmək.*

**KİLİDLİ** *sif.* Kilid vurulmuş, kilidlə bağlanmış; bağlı. *Kilidli qapı. Darvaza kilidlidir. – Balacayev əlini stola atıb güclə ayağa qalxdı. Qapı kilidli idi.* S.Rəhimov.

**KİLİM** *is.* [*fars.*] Yun və ya pambıqdan toxunan zolaqlı, xovsuz palaz növü. *Kiliмə bürün, el ilə sürün.* (Ata. sözü). *Qadınların*

*kimisi yun darayır, ip əyirir, kimisi xana qurub kilim toxuyurdu.* A.Şaiq.

**KİLİMARASI** *is.* Qədim xalq oyun növü.

**KİLİMÇƏ** *is.* Balaca kilim. [Yasavulu] *qaldırıb pəncərənin qabağında, üzərinə sürtük kilimçə salınmış, qılçaları laxlayan çarpayının üstünə uzatdılar.* S.Rəhimov.

**KİLİMÇİ** *is.* Kilim toxuyan və ya satan adam.

**KİLİMÇİLİK** *is.* Kilimçinin işi, peşəsi, sənəti.

**KİLKƏ**[1] *is.* 1. Bir-birinə qarışmış, dolanmış, pırtlaşıq saç, tük, yun, sap, ip və s. *Saçı kilkə kimi pırtlaşmaq. – İkinci qız Nərgizə: – Dayan, bu saat sənin kilkələrini yolaram.* Ə.Məmmədxanlı. *Qarı Mahmudun kilkə kimi pırtlaşmış zil qara saçlarına baxıb dedi..* Ə.Əbülhəsən. // Sif. mənasında. *Kilkə saç. – Qarının xınadan qızartdıq kilkələrinə elə bil heç vaxt daraq dəyməmişdi.* Ə.Məmmədxanlı.

2. Yun və ya saç darandıqda ondan çıxan qırıntı. *Yun atıldıqca didilir, kilkəsi çıxır.*

3. Mürəkkəbqabı, qəlyan və s.-nin içərisinə qoyulan tük.

**KİLKƏ**[2] *is.* [*rus.*] *zool.* Siyənəkkimilər ailəsinə mənsub xırda balıq növü.

**KİLKƏBAŞ** *sif. dan.* Daim saçları pırtlaşıq olan. *Kilkəbaş qız.*

**KİLKƏLƏNMƏ** "Kilkələnmək"dən *f.is.*

**KİLKƏLƏNMƏK** *f.* Kilkə düşmək, düyün düşmək, pırtlaşmaq. [Arvadın] *saçları pırtlaşıb kilkələnmiş, üstü-başı parça-parça olmuşdu. (*Qəzetlərdən).

**KİLKƏLƏŞMƏ** "Kilkələşmək"dən *f.is.*

**KİLKƏLƏŞMƏK** 1. B a x **kilkələnmək.**

2. *qarş.* Bir-birinin kilkəsini yolmaq; saçlaşmaq.

**KİLKƏLİ** *sif.* Kilkəsi olan (saç, yun və s. haqqında). *Kilkəli baş. – Ancaq Aqil üçün, bənizinə yeni qan gələn zəif vücudlu, sarı kilkəli körpəni tərpətmək dağlar qədər ağır gəlirdi.* S.Rəhimov.

**KİLKƏSAÇ** *sif.* Saçı kilkəli, pırtlaşıq. *Kilkəsaç uşaq. Kilkəsaç qız.*

**KİLKƏŞİK** *sif.* Dolaşıq, pırtlaşıq, qarışıq.

**KİLO** b a x **kiloqram.** [Qədirin] *yüz on səkkiz kilo ağırlığı olduğuna baxmayaraq, toylarda tərəkəmə oynayır, atı qızğın çapa-çapa duşüb minirdi.* İ.Əfəndiyev.

**kilo...** [*fr.*] Ölçü sistemində min kiçik vahidi ifadə edən mürəkkəb adların birinci hissəsi; məs.: kiloqram, kilometr, kilovat.

**KİLOQRÁM** [*fr.* kilo və *yun.* gramma] 1000 qrama bərabər çəki ölçüsü.

**KİLOQRAMLIQ** *is.* 1. Bir kiloqram ağırlığında olan çəki daşı. *Kiloqramlığı tərəziyə qoymaq. Kiloqramlığı bəri ver.*

2. Saylardan sonra gələrək şeyin neçə kiloqramdan ibarət olduğunu bildirir. *5 kiloqramlıq ət.*

**KİLOQRAMMÉTR** [*fr.* kilo, *yun.* gramma və metron] 1 kiloqram ağırlığında cismi 1 metr yüksəkliyə qaldırmaq üçün görülən işin ölçü vahidi.

**KİLOMÉTR** [*fr.* kilo və *yun.* metron] 1000 metrə bərabər, məsafəsi 1000 metr olan uzunluq ölçüsü. *Rüstəmin yaşadığı Səfalı kəndinin dəmir yolu ilə 20 dəqiqəlik, dəmir yolundan sonra da 2 kilometr yolu var idi.* T.Ş.Simurq. *Buradan Güneyqışlağa neçə kilometr olduğunu bilmirdim.* İ.Əfəndiyev.

**KİLOMETRÁJ** [*fr.* kilo və metrage] *Kilometrlə göstərilən məsafə.*

**KİLOMETRLİK** *is.* Saylardan sonra gələrək məsafənin neçə kilometrdən ibarət olduğunu bildirir. *Gorusun bir neçə kilometrliyində Nəbi Qarabağa gedən tacirlərə rast gəlir.* "Qaçaq Nəbi". *Fərmanın qış binası kəndin on kilometrliyində yerləşmişdi.* İ.Əfəndiyev.

**KİLOVÁT** [*fr.* kilo və *ing.* xüs. is.-dən] *fiz.* 1000 vata bərabər olan elektrik cərəyanının güc vahidi.

**KİLOVÁT-SAAT** [*fr.* kilo *ing.* xüs. is. və *ər.* saat] *fiz.* 1 kilovat gücündə elektrik cərəyanının 1 saat ərzində gördüyü işə bərabər olan elektrik cərəyanı vahidi.

**KİLSƏ** *is.* [əsli *yun.*] Xristian ibadətgahı, məbədi. *Seçilir qülləli, uca kilsələr; Qələbə tağları baxır göylərə; Bəlkə bir binanı silkələsələr; Bir şəhər işığı tökülər yerə.* M.Araz. *Kilsə başı zəng olur; Səsdən adam dəng olur; Tutaydım könül quşun; Görəydim nə rəng olur.* (Bayatı). // Xristianlarda: din işləri ilə, dini həyatla məşğul olan təşkilat; dini təriqət, məzhəb. *Pravoslav kilsəsi. Katolik kilsəsi.*

**KİM**[1] *əvəz.* 1. Cümlədə sual mənasında işlənib, insan adlarını və insan təsəvvürü

verən varlıqların adlarını əvəz edir; hansı adam. *Kim gəlib? O sözü kim dedi? Bu gün kim növbə çəkəcək? – Uşaq mənimdir, baba, dəxli nədir sizlərə? Kim sizi qəyyum edib hökm edəsiz bizlərə?* M.Ə.Sabir.

2. İki və daha artıq cümləni qarşılaşdırdıqda bölgü bildirmək üçün işlədilir. *Kim ölə, kim qala.* (Ata. sözü). [Zinyət xanım:] *Nə bilmək olar kim öləcək, kim qalacaq.* N.Vəzirov. *Görüşən, ayrılan kim, vidalaşan kim.* Mir Cəlal.

3. İnkarlıq bildirən fellərlə işlənib, "heç kəs" sözünü əvəz edir. *Kim duymamış ılıq səhərlərin dadını?* R.Rza.

4. "Hər kəs" sözünü əvəz edir. *Kim baxarsa kəc bir gün belə; Şərəfsiz olacaq ömrünün sonu.* M.Rahim. *Xıdırlı kəndində bir qayda var. Gecə əvvəlcə kimin qapısını döysən, gərək orada gecələyəsən.* S.Rəhman.

5. "Adam", "tanış", "qohum", "dost" mənalarında işlənib, inkar feli cümlələrdə təsdiq, təsdiq feli cümlələrdə inkar məzmunu yaradır. *Burada sənin kimin var? Onun kimi yoxdur? – Yazıq bir qızam, kimim vardır?* M.S.Ordubadi.

6. Cümlədə müəyyən şəxslər haqqında eyham və işarə məzmunu ifadə edir (əsasən cəmdə işlədilir). ["Molla Nəsrəddin"] *erməni-müsəlman qırğınının kimlər tərəfindən və nə üçün yaradıldığını ifşa etməkdə böyük rol oynamışdır.* M.İbrahimov.

7. **Kimlərdənsən, kimlərdəndir** və s. şəklində – "hansı nəsildənsən" ("nəsildəndir"), "qohumların (qohumları) kimdir" və s. mənalarında sual məqamında işlədilir. *Ay bala, kimlərdənsən? Qız kimlərdəndir?*

◊ **Heç kim** – heç kəs, heç kimsə. *Küçələrdə heç kim gözə dəymirdi.* M.Hüseyn. **Hər kim** – hər kəs. *Hər kim bu kəndə təzə gəlmiş olsaydı, iki məhəllənin bir-birindən seçilmədiyini görərdi.* N.Nərimanov. **Kim bilsin (bilə, bilir)** – "heç kəs" mənasında ara söz kimi işlədilir. [Məmməd:] *Arvad, ölüm ki var yuxu kimi bir şeydir, kim bilir, bəlkə bu gün, sabah düşüb öldüm.* "Aşıq Qərib". [Nökər] *ancaq təşəxxüs üçün, kim bilsin, hansı yaranalın köhnə paltarını geyinibdir.* S.Qənizadə. *Kim bilir, bəlkə də Mahru onu gözəl və yaraşıqlı bir gənc olduğu üçün sevirdi.* M.S.Ordubadi. **Kim ki** – o şəxs ki, o adam ki. *Kim ki insanı sevər aşiqihürriyyət olur; Bəli, hürriyyət olan yerdə də insanlıq olur.* M.Ə.Sabir. *Kim ki zəhmət çəkmədən, havayı yeyib, onun-bunun əməyilə dolanır, nəinki öz xalqının, öz vətəninin qanını soran bir tüfeylidir, həm də bütün bəşəriyyətə zərər vurur.* M.İbrahimov. **Kim kimədir!** – hərc-mərclikdir, qarışıqlıqdır, dolaşıqlıqdır, özbaşınalıqdır. [Atasının dostu:] *Bəlkə bir növlə dükanımızı əldə saxlayaq. Kim kimədir?* Qantəmir.

**KİM**[2] *klas.* Bax ki. *Xoş ol kəsə kim; Vel dolanıb, dağda çobandır; Asudə hamandır.* M.Ə.Sabir.

**KİMİ**[1] *qoş.* 1. Bənzətmə və müqayisə bildirir. *Ürəyi nanə yarpağı kimi əsir.* – [Sultan bəy:] *Mən bəy balası kimi qızımı arşın mal satana verəcəyəm?* Ü.Hacıbəyov. *Sanki göylərdə uçan quş kimiyəm; Sanki yerdən uçurulmuş kimiyəm.* M.Müşfiq.

2. Ani zaman bildirir. *Məktubu alan kimi gəl.* – [Əsgər:] *Gözüm səni görən kimi qəlbim sevindiyimdən çırpınmağa başladı.* Ü.Hacıbəyov. *Qız gözünü açan kimi yan-yörəsinə baxdı.* M.İbrahimov. *Səni görən kimi, a şirin üzlüm; Nədən tuti dilim mənim lal olur?* M.Rahim.

3. Yer, ya zaman həddini bildirir – ...qədər, ...dək. *Evə kimi bir yerdə getdik. – Rəsul bir saata kimi pinəçi dükanının qabağında durub pinəçilərə baxdı.* "Aşıq Qərib". *Fəraqdən gecələr yatmaram sabaha kimi..* X.Natəvan. [Fatma xanım:] *..Mən bu gecə sabaha kimi can vermişəm.* N.Vəzirov.

**KİMİ**[2] *əvəz.* Bəzisi, kimisi (adətən iki və ya bir neçə cümlə qarşılaşdırıldıqda bölgü bildirmək üçün işlənir). *Kimi xörək yeyir, kimi içir, kimi qəlyan, ya çubuq çəkir.* Ə.Haqverdiyev. *Kimi corab gətirdi; Kimi əlcək yetirdi.* M.Rahim. *Kiminin rüşvətxorluğu, qohumbazlığı, kiminin xəsisliyi, bəzisinin nadanlığı tənqid olunurdu.* Mir Cəlal.

**KİMİCƏ** *dan.* b a x **kimi**[1]**.** *On ikicə sinni qızın var tamam; Öz nəvəm Əsmər kimicə, vəssalam.* Ə.Nəzmi.

**KİMİSİ** b a x **kimi**[2]**.** *Hərə bu səsi bir cür qarşıladı; kimisi polis müdirinə yumruq göstərir, kimisi barmağı ilə hədələyir, kimisi*

*ağacla qorxudur, kimisi gülür, kimisi də "kəs səsini!" – deyə bağırırdı.* M.S.Ordubadi. *Kimisi səngər qazır; Kimisi məktub yazır.* B.Vahabzadə.

**KİM-KİMSƏ(NƏ)** *is.* Yaxın adam, dost-aşna, qohum, qohum-əqrəba. *Mənim səndən özgə yoxdur bir kəsim; Yüz kimin-kimsənən o ki var sənin.* Q.Zakir. *Yəqin Həpir ağıllanıb, kamil adam olub, bir də ki, .. şəhərdə kim-kimsəsi yoxdur.* Mir Cəlal.

**KİMOQRAF** [*yun.* kyma – dalğa və grapho – yazıram] 1. Müxtəlif fizioloji proseslərin qrafik qeydi üçün cihaz.

2. Eksperimental fonetikada: səs əyrisini qeyd edən cihaz.

**KİMONO** [*yap.*] 1. Yaponlarda xalat şəklində milli kişi və qadın geyimi.

2. Qolu xüsusi şəkildə biçilmiş qadın paltarı.

**KİMSƏ** 1. *əvəz.* Məlum olmayan şəxs, adam. *Səxavət olmayan kəsdə şücaət feli nadirdir; Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.* M.V.Vidadi. *Vaqif, bir kimsə ki bizdən yaşına; Yəqin bil ki, bizlən olmaz aşina.* M.P.Vaqif.

2. Heç kim, heç kəs, heç bir adam, heç biri. *Kimsə onun qabağına çıxa bilməz. Kimsəyə boyun əyməz. Kimsə gəlmədi. Kimsəni görmədim. – Bəs ki verməz yuxu göz açmağa fürsət kimsəyə; Sübh gün şanilə hər gün çeşmi-bidar axtarır.* Qövsi. *Kimsə bilməz ki, neçə yardən oldum məyus.* S.Ə.Şirvani. *Həyatdə kimsə yoxdu.* S.Hüseyn.

3. **Kimsədən** şəklində – heç kimdən, heç kəsdən, heç bir adamdan. *Kimsədən minnət götürməz. – Kim olduğumuzu yəqin ki, kimsədən soruşmadan bilirlər.* M.İbrahimov.

**KİMSƏNƏ** *əvəz. köhn.* Bir adam, bir kəs, kimsə, bir şəxs. *Yetişməz dadına heç bir kimsənə; Qalarsan naəlac, naçar, ağlarsan.* M.V.Vidadi. *Zalım fələk xub susayıb qanıma; Bir kimsənə yoxdur gələ yanıma.* Q.Zakir.

**KİMSƏSİZ** *sif.* 1. Heç kəsi (yaxın qohumu, arxası, köməyi) olmayan; adamsız. *Kimsəsiz uşaq. Kimsəsiz qadın. –* [Araz] *kimsəsiz, tək bir adam idi.* A.Şaiq. *Bu gün Hüseyn artıq arxasız və kimsəsiz bir yetimdir.* S.Rəhman. // İs. mənasında. *Hər gecə əxilər süfrəsi başında gördüyü o müxtəlif qəriblər və kimsəsizlər içərisində yavaş-yavaş bu qocanın da siması* [yolçunun] *xəyalında canlanırdı..* Ə.Məmmədxanlı.

2. İnsan yaşamayan, boş, adamsız, tənha. *Kimsəsiz yerlər. – Öz kimsəsiz torpağına baxdı Füzuli; Bir sönməyən şimşək oldu, çaxdı Füzuli.* Ə.Cavad. *Səməd .. uzaqdan görünən kimsəsiz tarlalara baxdıqca ürəyi sıxılırdı.* İ.Hüseynov.

**KİMSƏSİZLİK** *is.* 1. Kimsəsiz adamın halı; təklik, adamsızlıq. *Bu gözlənilməz sədəqə Sürəyyanın ürəyini kimsəsizliyin dərin acısı ilə doldurdu.* Ə.Məmmədxanlı. *Dahi şairin böyük arzularla dolu qəlbi ümidsizliklə, kimsəsizliklə* (z.) *boşalmışdı.* Mir Cəlal.

2. *məc.* Tənhalıq, adamsızlıq.

**KİMYA** [*ər.* əsli *yun.*] 1. Maddələrin quruluşunu, habelə onların qarşılıqlı olaraq bir haldan digər hala keçməsini öyrənən elm. *Nəzəri kimya. Kimya dərsliyi.*

2. Bir şeyin keyfiyyətcə tərkibi. *Neft kimyası. Qan kimyası.*

3. *məc. klas.* Hikmət, qüdrət.

**KİMYAÇI** *is.* 1. Kimya mütəxəssisi.

2. Kimya sənayesi işçisi.

**KİMYAGƏR** *is.* [*ər.* kimya və *fars.* ...gər] 1. *köhn.* bax **kimyaçı** 1-ci mənada. M.F.Axundzadənin *"Molla İbrahimxəlil kimyagər" komediyası. – Qız nə iş görür? – O da kimyagərdir.* İ.Əfəndiyev.

2. Keçmişdə: guya hər şeyi qızıla çevirmək sirr və sənətini bilmək iddiasında olan rəmmal. *Lalərəng etdi gözüm qan ilə xakidərini; Kimyagərdir, edər gördüyü torpağı qızıl.* Füzuli. *Bunlar hamısı keçəndən sonra, bu otuz doqquz nömrədə min doqquz yüz doxsan doqquz rəmmal, kimyagər, quşbaz .. şəkli çəkmişik.* C.Məmmədquluzadə.

**KİMYAGƏRLİK** *is.* 1. Kimyaçılıq.

2. *isteh.* Hər şeyi qızıla çevirmək iddiası və bu iddiada olan adamın halı. [Zahidoğlu:] *Deyəndə ki, .. burada kəşflər etmək olmaz, Fərhadoğlu üstümüzə bağırır, kimyagərliyə qurşanır.* S.Rəhimov.

**KİMYALAŞDIRILMA** "Kimyalaşdırılmaq"dan *f.is.*

**KİMYALAŞDIRILMAQ** "Kimyalaşdırmaq"dan *məch.*

**KİMYALAŞDIRMA** "Kimyalaşdırmaq"-dan *f.is.*

**KİMYALAŞDIRMAQ** *f.* Kimyanın və maddələri kimyəvi üsulla işləmə üsullarının nailiyyətlərini texnikada, sənayedə və kənd təsərrüfatında tətbiq etmək. *Kənd təsərrüfatını kimyalaşdırmaq.*

**KİMYƏVİ** *sif.* [*ər.*] 1. Kimyanın tədqiq etdiyi hadisə və proseslərə aid olan, kimyanın obyekti olan. *Kimyəvi element. Kimyəvi reaksiya. Suyun kimyəvi təhlili. Qanın kimyəvi tərkibi.*

2. İstehsalatda kimya üsullarının tətbiqi və bu üsullarla maddələr hazırlanması ilə əlaqədar olan. *Kimyəvi gübrələr. Kimyəvi maddələr. Ağacın kimyəvi üsulla işlənməsi.*

3. Sənayedə kimya üsulları ilə hazırlanan maddələrin hərbi məqsədlərlə tətbiqi ilə əlaqədar olan. *Kimyəvi silah. Kimyəvi mərmi.*

**KİN** *is.* [*fars.*] Gizli ədavət hissi. *Kin bəsləmək. Kin saxlamaq. Kini soyumaq. Qəlbində kin oyanmaq. – Süzdü rəssam onu altdan-yuxarı; Saçaraq gözləri kin dalğaları..* H.Cavid. [Əminə:] *Məni tanımır, ehtimal ki, bu hekayəni görüb mənə kin və qərəz bağlasın.* Qantəmir. *Şəfiqənin gülüşündə kin yox idi.* Ə.Məmmədxanlı.

**KİNAYƏ** *is.* [*ər.*] 1. Üstüörtülü, dolayı məna verən söz və ya ifadə. [Gülsabah Mirzə Camala:] *Mən artıq bu acı kinayələrdən usandım, öldüm, məni öldür.* C.Cabbarlı. [Tahirə] *baxır, deyəsən, o da Cəmilin kinayəsində həqiqət olduğunu təsdiq edərək istehzalı bir təbəssümlə gülürdü.* M.Hüseyn. ☐ **Kinayə etmək** – kinayə təriqi ilə söyləmək, işarə etmək. *..Şair Nəim "Füyuzat"ın 9-cu nömrəsində nəyə kinayə edibdirsə, özü bilər, ancaq bizim indiki əhvalımızı çox gözəlcə təsvir edib..* Ü.Hacıbəyov. // Üstüörtülü, toxunan söz. *Bu kinayələr, görəsən, kimə aiddir?*

2. *ədəb.* Bir şəxs və ya şey haqqında olan həqiqi fikir, təsəvvürü yalandan əks şəkildə ifadə edən söz, ibarə.

3. "ilə" qoşması ilə *zərf* – məsxərə ilə, kinayəli-kinayəli. *Kinayə ilə danışmaq. Kinayə ilə süzmək.*

**KİNAYƏLİ** *sif.* 1. İçində kinayə olan (b a x **kinayə** 1-ci mənada). *Kinayəli söz. Kinayəli baxış. – Bu, eyhamla deyilmiş kinayəli sözlər qocaları yerindən oynatdı.* R.Rza. *Mirzə ani bir sükutdan sonra kinayəli sözlərini dedi.* Mir Cəlal.

2. Rişxəndli. [Xortdanın] *qaçmağını gördükdə Molla Kərimdən kinayəli bir qəhqəhə çıxdı.* B.Talıblı.

**KİNDAR** [*fars.*] b a x **kinli.**

**KİNDARLIQ** b a x **kinlilik.**

**KİNEMATOQRAF** [yunancadan] 1. Hərəkət edən obyektlərin şəklini işığa həssas plyonkaya çəkmək, habelə bunları ekranda göstərmək üçün aparat; bu aparatın tətbiqinə əsaslanan tamaşa.

2. B a x **kinematoqrafiya.**

**KİNEMATOQRAFÇI** *is.* Kinematoqrafiya işçisi, kino mütəxəssisi.

**KİNEMATOQRAFÇILIQ** *is.* Kinematoqrafın işi, peşəsi, sənəti.

**KİNEMATOQRÁFİYA** [*yun.* kinema və grapho] Kinofilmlər hazırlamaq və onları nümayiş etdirmək sənəti. *Azərbaycan kinematoqrafiyası.* // Sənayenin kinofilmlər istehsal edən sahəsi. *Kinematoqrafiya müəssisələri.*

**KİNESKÓP** [*yun.* kineo və skopeo] Televiziyaya tətbiq edilən qəbuledici, elektrik şüa borusu.

**KİNETİK** *sif.* [*yun.*] 1. Kinetikaya aid olan.

2. Hərəkətə aid olan, hərəkətlə bağlı olan. ☐ **Kinetik enerji** – hərəkət enerjisi, cismin hərəkətindən asılı olan enerji ehtiyatı.

**KİNÉTİKA** [*yun.*] 1. Nəzəri mexanikanın dinamikanı və statikanı qavrayan şöbəsi.

2. Fiziki kimyanın, kimyəvi proseslərin sürət və mexanizmini öyrənən hissəsi.

**KİNƏ** *is. əcz.* Kinə ağacının qabığından hasil edilən acıdadlı ağ toz dərman; isitmə dərmanı. *Kinə atmaq.* – [Heybət:] *Dünən yaxşı idim, Xəlil dayı, heç nahaq yerə kinəni içmədim.* M.Hüseyn.

**KİN-KÜDURƏT** b a x **kin.**

**KİNLİ** *sif.* Kin saxlayan. *Kinli adam.* – *Dəvə kinli* (z.) *olar.* (Ata. sözü). [Xalq] *düşməninə qarşı kinli, inadlı, dostlarına qarşı olduqca mehriban və səmimidir.* M.S.Ordubadi. *Mehriban başını qaldırdı, kinli bir nəzərlə* [Zeynala] *baxdı.* S.Hüseyn. *Gənc və gözəl Səadətin nənəyə qarşı bu qədər acıqlı və kinli* (z.) *olmasının səbəbi nə idi?* İ.Əfəndiyev.

**KİNLİ-KİNLİ** *zərf* Kinli halda, kinli bir tərzdə; qəzəbli. *Yamacın yetimçəsi mənə qalmayıb, – deyə* [Əlləzoğlu] *kinli-kinli söylənirdi.* İ.Hüseynov.

**KİNLİLİK** *is.* Kin saxlama, gizli ədavət bəsləmə, ürəyində kinsaxlama xasiyyəti.

**KİNÓ** [*yun.* kinema – hərəkət edən] 1. B a x **kinematoqrafiya**. *Hələ 1927-1928-ci illərdə Cabbarlı kino sənəti ilə maraqlanmağa başlamışdı.* M.Arif.

2. *dan.* b a x **kinofilm.** *Kino göstərmək. – Saat iki olar; Uşaqlar üçün televizor; Kino verəcək bu gün.* M.Rahim. *Bütün tərsliyinə baxmayaraq,* [Musa] *ömründə bir kino tamaşası buraxmazdı.* İ.Əfəndiyev.

3. B a x **kinoteatr.** [Səlim və Mehriban] *sonra bulvardakı "Yeni kənd" kinosuna gedib hazırkı həyatdan alınmış faciəyə tamaşa etmişlərdi.* S.Hüseyn. [Firidun] [Südabənin] *yenə kinoya getməyə, yaxud gəzməyə çıxmağa gəldiyini güman etdi.* M.İbrahimov. ☐ **Kino budkası** – kinoaparat və kinomexanik üçün xüsusi yer, budka.

**kino...** [*yun.*] Kinematoqrafiya ilə bağlı olan mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: kinoxronika, kinojurnal, kinooçerk, kinooperator.

**KİNOAKTYÓR** [*yun.* kine və *fr.* acteur] Kinofilmlərdə çəkilən artist.

**KİNOAKTRİSA** [*yun.* kine və *fr.* acteur] Kinofilmlərdə çəkilən aktrisa.

**KİNOAPARÁT** [*yun.* kine və *lat.* apparatus] Kinofilmləri göstərmək üçün aparat.

**KİNOARTİST** [*yun.* kine və *fr.* artiste] b a x **kinoaktyor.**

**KİNOATELYE** [*yun.* kine və *fr.* atelier] Kinofilmləri çəkmək üçün xüsusi bina, atelye.

**KİNODRÁMA** [*yun.* kine və drama] Drama əsasında çəkilmiş film.

**KİNODRAMATURGİYA** [*yun.* kine və dramaturgia] Kinematoqrafiya vasitələri ilə nümayiş etdirilmək üçün yazılan ədəbi əsərlər (bir janr kimi).

**KİNODRAMATURQ** [*yun.*] Kino (2-ci mənada) üçün ssenari yazan yazıçı, dramaturq.

**KİNOFABRİK** [*yun.* kine və *lat.* fabric] Kinoşəkillər istehsal edən müəssisə, iri kinostudiya.

**KİNOFACİƏ** [*yun.* kine və *ər.* faciə] Faciə əsasında çəkilmiş kinofilm.

**KİNOFESTİVAL** [*yun.* kine və *lat.* festival] Ümumi bir mövzuya həsr edilmiş kinofilmlərin, yaxud hər hansı bir ölkənin ən yaxşı kinofilmlərinin göstərilməsi.

**KİNOFİLM** [*yun.* kine və *ing.* film – lent] Ekranda göstərilmək üçün kinoşəkil. *"Leyli və Məcnun" kinofilmi.*

**KİNOXRÓNİKA** [*yun.* kine və chronikos] Mövzusu cari həyatdan alınmış kinofilm və ya kinojurnal. // Kino incəsənətinin, gündəlik həyatın ayrı-ayrı hadisələrini əks etdirməklə bağlı olan janrı.

**KİNOJURNAL** [*yun.* kine və *fr.* journal] Gündəlik həyatdan ayrı-ayrı epizodları, səhnələri nümayiş etdirən qısametrajlı kinofilm.

**KİNOKADR** [*yun.* kine və *fr.* kadre] Kino lentində olan kadrlardan hər biri.

**KİNOKOMEDİYA** [*yun.* kine və komodia] Kino sənəti janrlarından biri; gülməli məzmunlu kinofilm.

**KİNOQURĞU** *is.* Kinofilmləri göstərmək üçün qurğu (cihazlar, aparatlar və s.).

**KİNOLAŞDIRILMA** "Kinolaşdırılmaq"-dan *f.is.*

**KİNOLAŞDIRILMAQ** *məch.* Hər hansı bir rayonda, yerdə kinoteatrlar və səyyar kinolar təşkil edilmək, kino şəbəkəsi yaradılmaq.

**KİNOLAŞDIRMA** "Kinolaşdırmaq"dan *f.is. Kinolaşdırma işləri genişlənmişdir.*

**KİNOLAŞDIRMAQ** *f.* 1. Hər hansı bir rayonda, kənddə, qəsəbədə və s.-də daimi surətdə kinofilmləri göstərmək üçün kinoteatrlar və səyyar kinolar təşkil etmək, kino şəbəkəsi yaratmaq. *Kəndi kinolaşdırmaq. Məktəbləri* (*klubları*) *kinolaşdırmaq.*

2. Bir əsəri kinoya çəkmək üçün uyğunlaşdırmaq, kinoya çəkmək. *Povesti kinolaşdırmaq.*

**KİNOLAŞMA** "Kinolaşmaq"dan *f.is. Kəndin kinolaşması.*

**KİNOLAŞMAQ** *f.* Kinofilmləri nümayiş etdirmək üçün lazımi avadanlıqla təmin etmək, edilmək. *Kənd kinolaşdı.*

**KİNOLENT** [*yun.* kine və *ital.* lenta] Kinofilmin ayrıca nüsxəsi, surəti.

**KİNOMEXÁNİK** [*yun.* kine və mechanike] Kinofilmləri nümayiş etdirən, kinoaparata xidmət edən mexanik.

**KİNOMEXANİKLİK** *is.* Kinomexanikin işi, sənəti, ixtisası.

**KİNOMONTÁJ** [*yun.* kine və *lat.* montage] Çəkilmiş ayrı-ayrı kinokadrların müəyyən ardıcıllıqla bir-birinə calanması, quraşdırılması.

**KİNOÓÇERK** [*yun.* kine və *rus.* oçerk] Oçerk əsasında çəkilmiş film.

**KİNOOPERÁTOR** [*yun.* kine və *lat.* operator] Kinofilmləri çəkən mütəxəssis.

**KİNOOPERATORLUQ** *is.* Kinooperatorun işi, sənəti, məşğuliyyəti, ixtisası.

**KİNOPOVEST** [*yun.* kine və *rus.* povest] Povest əsasında çəkilmiş film.

**KİNOREJİSSÓR** [*yun.* kine və *fr.* regisseur] Kinofilmlərin quruluşçusu olan rejissor.

**KİNOREJİSSORLUQ** *is.* Kinorejissorun işi, sənəti, ixtisası.

**KİNOSEÁNS** [*yun.* kine və *fr.* seanse] Kinofilmlərin müəyyən proqramının nümayiş etdirilməsi üçün ayrılan vaxt.

**KİNOSSENÁRİ** [*yun.* kine və *ital.* scenario] Əsasında kinofilm çəkilən ədəbi əsər. *..Cabbarlı "Hacı Qara" komediyasının kinossenarisini yazmış, filmin çəkilişində yaxından iştirak etmişdi.* M.Arif.

**KİNOSSENARİST, KİNOSSENARİÇİ** *is.* Kinossenari yazan yazıçı; kinodramaturq.

**KİNOSTÚDİYA** [*yun.* kine və *ital.* studio – səy, çalışma] Kinofilmlər istehsal edilən müəssisə. *Kinostudiya yeni bir filmin ayrı-ayrı hissələrini çəkmək üçün dağlara bir ekspedisiyaya hazırlaşırdı.* İ.Əfəndiyev.

**KİNOŞƏKİL** [*yun.* kine və *ər.* şəkl] b a x **kinofilm.** *Əmiraslan baba .. Turşsuyun da tanınmasını, belə kinoşəkillərə düşməyini, şöhrət qazanmağını istəyirdi.* S.Rəhimov.

**KİNOŞÜNAS** [*yun.* kine və *fars.* ...şünas] Kinoşünaslıq sahəsində çalışan alim.

**KİNOŞÜNASLIQ** *is.* Kino incəsənəti haqqında elm.

**KİNOTEÁTR** [*yun.* kine və teathro] Kinofilmləri tamaşaçılara göstərmək üçün xüsusi bina. *"Nizami" kinoteatrı. – Qadınlar üçün kinoteatr təşkil edilmişdi.* M.S.Ordubadi.

**KİNSİZ** *sif.* Kini olmayan, ürəyində kin saxlamayan. *Kinsiz adam.*

**KİÓSK** [*fr.* kiosque, əsli köşk] Xırda alver, cürbəcür arayışlar vermək və s. üçün kiçik tikili; pavilyon. *Gül kiosku. Su kiosku. Qəzet kiosku.*

**KİOSKÇU** *is.* Kioskda satıcı.

**KİP** *zərf* 1. Bir-birinə sıx, yaxın. *Nə uzun, nə gödək, münasib gərək; Ağzı, burnu nazik, dodaq kip gərək.* Aşıq Ələsgər.

2. Möhkəm, bərk. *Kip bağlamaq. Kip sıxmaq. Sarğı kip olmalıdır. – Qapı ehmalca çəkilib çərçivəsində kip oturdu.* İ.Hüseynov.

**KİPCƏ** *zərf* Çox kip, möhkəm, sıx. *Qapını kipcə örtmək. – O, xəz yaxalı qara paltosunu düymələdi, papağını öz səliqəsinə görə başına kipcə yerləşdirdi.* Ə.Əbülhəsən.

**KİPCƏK** b a x **kipkəc.**

**KİPKƏC** 1. *is.* Mexanizmin hərəkət edən hissələrinin ətrafında açıq qalan yerləri sıx-sıx qapayan və mayenin, buxarın, ya qazın sızıb çıxmasının qarşısını alan detal. *Su nasosu gövdədən, pərli çarxdan, valcıqdan və kipkəclərdən ibarətdir.* Ə.Əlizadə.

2. *sif. məh.* Ortabab, orta vəziyyətdə olan, nə enli, nə dar; yığcam. *Kipkəc ev.*

**KİPKƏCLİ** *sif.* Kipkəci olan. *Kipkəcli mexanizm.*

**KİPLƏMƏ** "Kipləmək"dən *f.is.*

**KİPLƏMƏK** *f.* Kip qapamaq, kip bağlamaq; möhkəmlətmək, bərkitmək. *Deşiyi kipləmək.*

**KİPLƏNMƏ** "Kiplənmək"dən *f.is.*

**KİPLƏNMƏK** *məch.* Kip qapanmaq, kip bağlanmaq; kip olmaq, kipləşmək.

**KİPLƏŞDİRİCİ** b a x **kipkəc** 1-ci mənada.

**KİPLƏŞDİRİLMƏ** "Kipləşdirilmək"dən *f.is.*

**KİPLƏŞDİRİLMƏK** "Kipləşdirmək"dən *məch.*

**KİPLƏŞDİRMƏ** "Kipləşdirmək"dən *f.is.*

**KİPLƏŞDİRMƏK** b a x **kipləmək**.

**KİPLƏŞMƏ** "Kipləşmək"dən *f.is.*

**KİPLƏŞMƏK** b a x **kiplənmək**.

**KİPLİK** *is.* 1. Kip şeyin halı; sıxlıq, yaxınlıq. *Klapan və onun yuvasının oturacaq səthlərində lazımi kiplik və hamarlıq yaradılana qədər sürtülmə prosesi davam etdirilir.* Ə.Əlizadə.

2. Möhkəmlik, bərklik.

**KİR** *is.* Çirk. *Kir bağlamaq. Kir tutmaq. – Qoca .. boynu kir bağlamış arxalığındakı saysız yamaqları ilə .. hamının diqqətini özünə cəlb edirdi.* M.Hüseyn.

**KİRAYƏ** bax **kirə.** *Armud özgənin, eşşək kirayə.* (Məsəl). [Hacı:] *..Amma bunu mən dörd manata kirayəsinə götürmüşəm.* Ə.Haqverdiyev. *Hər kəsin artıq otağı vardısa, kirayə vermək üçün hazırlamağa başladı.* B.Bayramov.

**KİRAYƏÇİ** bax **kirəçi.** *Ev sahibinin bir evi, kirayəçinin min evi olar.* (Məsəl). *Təzə kirayəçi öz ölkələrindən bizə nəql edəcək.* Çəmənzəminli.

**KİRAYƏÇİLİK** bax **kirəçilik.** *..Nurəddin arabasını qoşub şəhərə kirayəçiliyə getdi.* S.S.Axundov.

**KİRAYƏLİ** bax **kirəli.**

**KİRAYƏLİK** bax **kirəlik.**

**KİRAYƏNİŞİN** [*fars.*] bax **kirənişin.** *Kirayənişinlərdən biri çamadanının qapağını tutub dururdu.* T.Ş.Simurq. *Günlərin bir günündə Fatmayı kəndlisi Ağayevin evinə kirayənişinlər gəldi.* S.Rəhman.

**KİRDAR** *is.* [*fars.*] 1. İş, əməl, hərəkət. *Ey Vidadi, gərdişi-dövrani-kəcrəftarə bax; Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax.* M.P.Vaqif. *Xandostu! Amandı, qoyma gəldi; Kirdarı yamandı, qoyma gəldi!* M.Ə.Sabir. □ **Kirdardan düşmək** – artıq heç bir işə yaramamaq, yararsız hala gəlmək. [Səfər kişi:] *Demək, mən lazım ola bilərəm, .. mən hələ kirdardan düşməmişəm.* Mir Cəlal.

2. Səbir, hövsələ. *Kirdarım yoxdur. – Anada o kirdar hanı, telefona gələ, nömrə tapa, belə odlu-odlu danışa.* Mir Cəlal. □ **Kirdarı gəlməmək** – hövsələsi çatmamaq, səbri gəlməmək, həvəsi olmamaq. [Mehriban] *bir istədi ki, Şərifənin gördüyü işi onun əlindən alıb görsün. Nədənsə buna da kirdarı gəlmədi.* S.Hüseyn. **Kirdarını kəsmək** – hövsələdən çıxartmaq. *Lakin Şahpəri ilə baş verən hadisə* [Şahmarın] *kirdarını kəsmişdi.* B.Bayramov.

**KİRDARLI** *sif. dan.* 1. İşlək, dözümlü. *Kirdarlı oğlan. Kirdarlı adam. – Sən bu atın beləliyinə baxma, yaman kirdarlı heyvandır.* S.Rəhimov.

2. Oxşar, bənzər, kimi. *Molla ədalı, sufi kirdarlı; Nitqi həqiqətli, sözü fal kişi.* M.Ə.Sabir.

**KİRDARSIZ** *sif.* 1. Bacarıqsız, qabiliyyətsiz, aciz. *Elə oğlan var hazır çörəyi çeynəyib ağzına qoyursan, uda bilməyir, aciz, bədbəxt, kirdarsızdır.* Mir Cəlal.

2. Hövsələsiz, səbirsiz.

**KİRDARSIZLIQ** *is.* 1. Bacarıqsızlıq, qabiliyyətsizlik, acizlik.

2. Səbirsizlik, hövsələsizlik.

**KİRƏ** *is.* [*fars.*] 1. Bir şeyin müəyyən haqq müqabilində müvəqqəti olaraq sahibi tərəfindən başqasına istifadəyə verilməsi; kirayə. □ **Kirə etmək** – müəyyən haqq müqabilində bir şeydən müvəqqəti istifadə etmək. *Çox fikirdən sonra mənzil kirə edib... məşğul oldu ticarətə.* Ə.Haqverdiyev. **Kirəyə vermək** – bir haqq müqabilində müvəqqəti istifadə üçün başqasına vermək. *Çoxdan anası deyirdi ki, otaqların ikisini kirəyə verəcək.* S.Rəhman.

2. İstifadəyə verilən şeyin haqqı, kirayə haqqı. *Ev kirəsi.* – [Qafar:] *Bu gün xozeyindən əmr çıxmış ki, pinəçi Qafar tutduğu yerə kirə versin.* S.S.Axundov. *Hacı Sultan .. iki evindən aldığı kirələrin sayəsində rahatlıqla keçinirdi.* S.Hüseyn.

**KİRƏC** *is.* Tikintidə, heykəltəraşlıqda, cərrahlıqda və s.-də işlənən ağ və ya sarı rəngli əhəngli mineral maddə; gəc. [Babakişi:] *Türkün sözü, kirəc qoydular, sarıdılar, bax belə.* C.Cabbarlı. *Kirəci tökülmüş divardan Mürsəl kişinin tüfəngi asılmışdı.* M.Hüseyn. *Həyət taxta parçaları ilə, kirəc, qum və palçıqla dolu idi.* S.Rəhman.

**KİRƏCLƏMƏ** "Kirəcləmək"dən *f.is.*

**KİRƏCLƏMƏK** *f.* 1. Kirəclə örtmək, suvamaq.

2. Üstünə kirəc (gips) sarğısı qoymaq; gipsləmək (sınıq yeri).

**KİRƏCLƏNMƏ** "Kirəclənmək"dən *f.is.*

**KİRƏCLƏNMƏK** *məch.* 1. Kirəclə örtülmək (suvanmaq), kirəc vurulmaq.

2. Üstünə kirəc (gips) sarğısı qoyulmaq; gipslənmək.

**KİRƏCLƏŞMƏ** "Kirəcləşmək"dən *f.is.*

**KİRƏCLƏŞMƏK** *f.* Kirəc halına gəlmək.

**KİRƏCLİ** *sif.* Tərkibində kirəc olan. *Kirəcli su. Kirəcli torpaq.*

**KİRƏÇİ** 1. Bax **kirənişin.** *Mirzə Qədir evindəki kirəçilərdən heç birini dışarı çıxara bilməyəcəkdi.* S.Hüseyn.

2. Bax **kirəkeş.**

**KİRƏÇİLİK** bax **kirəkeşlik.** *Qəhrəman muzdurluq, kirəçilik edərdi.* Ə.Vəliyev.

**KİRƏDAR** [*fars.*] *köhn.* bax **kirənişin.**

**KİRƏKEŞ** [*fars.*] *köhn.* Haqq müqabilində başqası üçün at, araba və s. ilə yük daşıyan adam; kirəçi. [Gəmiçi:] *Sözüm yoxdur, biz kirəkeş babayıq.* M.Rzaquluzadə.

**KİRƏKEŞLİK** *is. köhn.* Kirəçinin peşəsi, işi, məşğuliyyəti; kirəçilik.

**KİRƏLƏMƏ** "Kirələmək"dən *f.is.*

**KİRƏLƏMƏK** *f.* Kirə ilə tutmaq, kirə etmək; kirayələmək. *Ev kirələmək. At kirələmək.*

**KİRƏLƏNMƏ** "Kirələnmək"dən *f.is.*

**KİRƏLƏNMƏK** *məch.* Kirə edilmək, kirə ilə tutulmaq; kirayələnmək.

**KİRƏLİ** *sif.* Kirə ilə tutulmuş, kirayə verilmiş. *Kirəli ev. Kirəli dükan.*

**KİRƏLİK** *is.* Kirə ilə tutma. *Özününkün verib yarılığa; Özgədən tutub kiralığa.* (Ata. sözü).

**KİRƏMİT** *is.* [*yun.*] Damların üstünü örtmək üçün gil, ya sementdən hazırlanan novşəkilli lövhəcik. *Kirəmit zavodu.* // Kirəmitdən, kirəmitlə örtülmüş. *Küçələrin o tərəf-bu tərəfində qırmızı kirəmit, dəmir taxtapuşlu ağ evlər .. ucalmışdır.* Ə.Vəliyev. *Bir az kənarda qırmızı kirəmit damlı geniş ağ korpuslar görünürdü.* M.Rzaquluzadə.

**KİRƏMİTBİŞİRƏN** *is.* Kirəmit karxanası işçisi.

**KİRƏMİTÇİ** *is.* Kirəmit ustası; kirəmitbişirən.

**KİRƏMİTLİ** *sif.* Kirəmitlə örtülmüş. *Kirəmitli dam. – İskəndər kişi də* [Səlim müəllimi] *kəndin düz ortasında tikilmiş, yumru təpə yanındakı sarı kirəmitli məktəbə qədər ötürdü.* M.Hüseyn. [Züleyxa] *birmərtəbəli üstü qırmızı kirəmitli evə doğru yollandı.* M.İbrahimov.

**KİRƏNİŞİN** *is.* [*fars.*] Bir evdə kirə ilə yaşayan adam, mənzil kirə etmiş şəxs; kirəçi, kirayənişin.

**KİRİDİLMƏ** "Kiridilmək"dən *f.is.*

**KİRİDİLMƏK** *məch.* Səsi kəsdirilmək; susdurulmaq.

**KİRİKMƏK** b a x **kirimək.**

**KİRİMƏ** "Kirimək"dən *f.is.*

**KİRİMƏK** *f.* 1. Səsini kəsmək, susmaq, dinməmək. *Uşaqlar kiridilər. – Ölüsü ölən kiridi, yasa gələn kirimədi.* (Ata. sözü). *Şirin sözlərinin çox müştaqiyəm; Danışmayıb kiriməyin nədəndir?* M.P.Vaqif. [Tubu:] *İndiyəcən oğlu ölən kiridi, qardaşı ölən kiridi, amma sən kiriməк bilmirsən.* Ə.Haqverdiyev.

2. Rahatlanmaq, ovunmaq, sakitləşmək. [Paşa:] *Nə olar, uşaq döyülər də, ağlar da, kiriyər də!* Mir Cəlal. *Göyün üzü ağladıqdan sonra kirimiş və gülməyə başlamış uşaq gözlərinə bənzəyirdi.* Ə.Vəliyev.

**KİRİMİŞCƏ** *zərf* Sakitcə, susmuş halda, səsini çıxarmadan, sakit-sakit, dinmədən, dinməz-söyləməz. *Molla Nəsrəddin də bir tərəfdə kirimişcə oturub qulaq asırmış.* "M.N.lətif." [Koroğlu] *gördü kişi kirimişcə durub maddım-maddım baxır onun üzünə.* "Koroğlu". [İlyas Adiləyə:] *Sonra hərdənbir anamla görüşəndə ondan eşidirdim ki, dayım bütün günü kirimişcə gəzirdi.* Ə.Məmmədxanlı.

**KİRİŞ** *is.* 1. Möhkəm ip. *Dəmirçioğlu başa düşdü ki, onun qollarını mumlu kirişlə bağlayıblar.* "Koroğlu".

2. Ox yayının iki ucuna tarım bağlanan ip. *Kirişi çəkmək. – Xan üçhaçalı bir oxu kirişə qoydu, .. oxu atıb gözlərini yumdu.* M.Rzaquluzadə. // Mişar çərçivəsinin tarım ipi. *Mişarın kirişi qırıldı.* // Cəhrəni işlədən ip. *Cəhrənin kirişini tarımlamaq.*

**KİRİŞÇİ** *is.* Kiriş hazırlayan usta.

**KİRİŞLƏMƏ** "Kirişləmək"dən *f.is.*

**KİRİŞLƏMƏK** *f.* Kiriş çəkmək.

**KİRİŞMƏ** "Kirişmək"dən *f.is.*

**KİRİŞMƏK** *qarş.* Kiriməк (çoxları haqqında). [Ana və gəlin] *kirişəndə qızlar ağladı, qonaqlar ağladı.* Çəmənzəminli.

**KİRİTMƏ** "Kiritmək"dən *f.is.*

**KİRİTMƏK** *icb.* 1. Susdurmaq, sakitləşdirmək, səsini kəsməyə məcbur etmək.

2. Sakit etmək, ovundurmaq. [Pərzad Telliyə:] *Onda bir parça çörək ver, uşaqları hələ kiridim, sonra gələrik.* Çəmənzəminli. [Dərviş:] *Ürək verib Ruqiyyəni kiritdim.* A.Divanbəyoğlu.

**KİRKİRƏ** *is.* Əldəyirmanı. ☐ **Kirkirə kimi** – dəyirman kimi. *Şahpərinin çənəsi kirkirə kimi üyüdür, Yusifə dillənmək üçün macal vermirdi.* B.Bayramov.

**KİRKİ(T)**[1] *is. xüs.* Xalça toxunarkən ilmələrini sıxlaşdırmaq üçün işlədilən alət; daraq, həvə.

**KİRKİT**[2] *sif.* Qabığı çox bərk olmayan (qoz, badam və s. haqqında). *Qoz sortları*

*meyvə qabığının bərkliyinə görə üç cür olur: yumşaq və ya nazikqabıqlı – buna kağızı qoz, qabığı orta bərklikdə olana kirkit qoz, qabığı çox bərk olana isə çətənə qoz deyirlər.* İ.Axundzadə.

**KİRKİTLƏMƏ** "Kirkitləmək"dən *f.is.*

**KİRKİTLƏMƏK** *f.* Kirkitlə ilmələrini sıxlaşdırmaq, kirkit vurmaq. *Xalçanı kirkitləmək.*

**KİRKİTMƏ** "Kirkitmək"dən *f.is.*

**KİRKİTMƏK** bax **kirkitləmək.**

**KİRLƏNDİRİLMƏ** "Kirləndirilmək"dən *f.is.*

**KİRLƏNDİRİLMƏK** *məch.* Çirkləndirilmək.

**KİRLƏNDİRMƏ** "Kirləndirmək"dən *f.is.*

**KİRLƏNDİRMƏK** bax **kirlətmək.** *Paltarı kirləndirmək.*

**KİRLƏNMƏ** "Kirlənmək"dən *f.is.*

**KİRLƏNMƏK** *f.* Çirklənmək, kirli hala gəlmək. *Tərdən yaxası kirləndi. Üst-başı kirləndi.*

**KİRLƏNMİŞ** *f.sif.* Çirklənmiş, kirli, çirkli. *Sonra da kirlənmiş bir yaylıq kimi; Atılmış o bizim yazıq analar.* S.Vurğun.

**KİRLƏTMƏ** "Kirlətmək"dən *f.is.*

**KİRLƏTMƏK** *f.* Kirləndirmək; kirli, çirkli etmək; çirkləndirmək.

**KİRLİ** *sif.* Kir tutmuş, çirk basmış; çirkli. *Kirli yun. Kirli əl. Kirli paltar. – Yaylığı kirli balam; Qəlbi fikirli balam; Cahıl-cuhul içində; Mənim şəkilli balam.* (Bayatı). *Bu sulu, palçıqlı, kirli dünyada; Səməndər quşunu salırsan yada!* Şəhriyar.

**KİRLİK** *is.* Bir şeyin çirklənməməsi üçün onun üzərinə çəkilən parça. // Döşlük, önlük. *Kirlik geymək.*

**KİRLİLİK** *is.* Kirli şeyin halı; çirklilik.

**KİR-PAS** bax **kir.** *Kir-pası tökülmək. Kir-pas içində olmaq.*

**KİRPİ** *is. zool.* Məməlilər sinfindən dərisi tikanla örtülü heyvan. *Çəpgöz ayı, yumru kirpi; Yanlarında qara böcək; Dedilər ki, qış gəlməmiş; Yuvalara enək gərək.* M.Dilbazi.

◊ **Kirpi kimi qınına çəkilmək** – cəmiyyətdən, insanlardan uzaqlaşaraq özünə qapanmaq.

**KİRPİK** *is.* 1. Göz qapağının kənarlarındakı tükcüklər. *Uzun kirpiklər. – Anamın buz məzarından; Bilirəm ki, neçə dəfə; Torpaq alıb kirpiklərin.* M.Araz. *Qızarmış yanaqları, uzun kirpikləri, iri gözlərinin süzgün baxışı ona məlahət verirdi.* T.Ş.Simurq. ☐ **Kirpiklərini endirmək** – yerə baxmaq. *Kəmalə məndən utanırmış kimi kirpiklərini aşağı endirdi.* M.Hüseyn. *Mehriban kirpiklərini ağır-ağır endirdi.* H.Seyidbəyli. **Kirpiklərini qaldırmaq** – gözlərini açmaq; baxmaq, süzmək. *O, kirpiklərini qaldırıb yarıaçılmış qapıya baxdı.* M.İbrahimov. *Məsum kişi .. kirpiklərini qaldıranda havanın tamam qaranlıqlaşdığını görüb yatağını açdı..* Mir Cəlal. **Kirpiklərini qırpmaq** – tez-tez gözlərini açıb yummaq. *İmi .. kirpiklərini tez-tez qırpmağa başladı.* İ.Əfəndiyev.

2. *xüs.* bax **kirpikcik.**

◊ **Kirpik çalmaq (çaxmaq)** – heyrətdən, təəccübdən tez-tez gözlərini açıb yummaq. *Ovçu gendən yayındı; Oxu məndən yayındı; Bir dəfə kirpik çaldım; Gözüm səndən yayındı.* (Bayatı). *Kirpik çaxdı, oğrun baxdı; Od saldı cana, yeridi.* Aşıq Ələsgər. *Səriyyə xanım .. kirpik çalır və ağzındakı saqqızını yavaş-yavaş çeynəyirdi.* M.S.Ordubadi. **Kirpik (kirpiklərini) döymək** – bax **kirpik çalmaq.** [Rəşid] *ani olaraq uzun kirpiklərini döyərək qara, nazik qaşlarını tərpətdi.* M.İbrahimov. *Yusif kirpiklərini döyüb özünü oyaq göstərməyə çalışdı.* B.Bayramov. *Əlləzoğlu kirpiklərini tez-tez döyüb bic-bic irişdi.* İ.Hüseynov. **Kirpik (kirpiklərini) qırpmamaq (qırpmadan)** – dik, diqqətlə, gözlərini yummamaq (yummadan). *Qoca bunları görmür kimi kirpiyini belə qırpmır.* Çəmənzəminli. [Gülsənəm:] *də kirpiklərini qırpmadan Cəmilə baxırdı.* M.Hüseyn. **Kirpikləri titrəmək** – hirslənmək, haldan çıxmaq. *Bu ana qədər buxarının istisindən xumarlanan və qərarından getməyən Rəhim bəyin kirpikləri titrədi..* M.Hüseyn. **Kirpiyi (kirpikləri) ilə od götürmək (qaldırmaq)** – çox ağır əziyyət, zülm çəkmək.

**KİRPİKCİK** *is.* 1. Qısa, kiçik kirpik.

2. *adətən cəm şəklində, xüs.* Bəzi heyvanların hüceyrələrində və bitkilərdə kirpiyə oxşar törəmələr.

**KİRPİKLİLƏR** *cəm. zool.* Kirpikləri olan heyvanlar sinfi.

**KİRPİKSİZ** *sif.* Kirpikləri olmayan və ya çox seyrək olan. *Kirpiksiz gözlər.*

**KİRS**[1] *is.* Yara sağaldıqdan sonra ətrafında qalan bərkimiş şiş. *Yara sağalar, kirsi yox.* (Ata. sözü).

**KİRS**[2] *is.* Parçada, xalçada və s.-də qırış, bükük.

**KİRSLİ** *sif.* Kirsi olan (b a x **kirs**). *Kirsli yara.*

**KİRŞAN** *is.* Qadınların üzlərinə sürtdükləri ağ və ya ət rəngində ətirli, kosmetik toz maddə. *Əziziyəm, bizə gəl; Al-yaşıl gey, bizə gəl; Üzün kirşanı neylər; Çək sürməni gözə, gəl.* (Bayatı). *Ənliyi-kirşanı neylər camalın; Sən elə gözəlsən binadan, pəri!* M.P.Vaqif. ☐ **Kirşan vurmaq (sürtmək)** – b a x **kirşanlanmaq.**

**KİRŞANLAMA** "Kirşanlamaq"dan *f.is.*

**KİRŞANLAMAQ** *f.* Üzə, yanağa kirşan sürtmək. [Qətibənin] *çöhrəsini Bağdad və Xorasanın ağ mərmər rəngli kirşanları ilə kirşanladılar.* M.S.Ordubadi.

**KİRŞANLANMA** "Kirşanlanmaq"dan *f.is.*

**KİRŞANLANMAQ** *məch.* Üzə kirşan vurulmaq, kirşan sürtülmək.

**KİRŞANLI** *sif.* Kirşan sürtülmüş, kirşan vurulmuş. *Kirşanlı üz. – Kirşanlı buxağa, sürtük yanağa; Qondarma xallara vurulmuş ağa.* H.K.Sanılı.

**KİRŞƏ** *is.* Altı hamar iki paralel xizək üzərində düzəldilmiş minik və ya yük arabası. *Kirşə ilə odun daşımaq.* // Uşaqlar üçün kiçik əl kirşəsi. [Kamal] *dərsdən sonra .. kəndin kənarındakı təpədə kirşə sürməyə gedərdi.* M.Rzaquluzadə.

**KİRŞƏBAĞLAYAN** *is.* Kirşəqayıran usta; kirşəçi.

**KİRŞƏÇİ** *is.* 1. Kirşə işlədən, kirşə sürən adam.

2. B a x **kirşəbağlayan.**

**KİRT**[1] *is.* Dəridə əmələ gələn qırış, bükük, büzüm.

**KİRT**[2] *təql.:* **kirt dayanmaq** – birdən hərəkətdən qalmaq, birdən dayanmaq. *Saat işlədiyi yerdə birdən kirt dayandı. Uşaqlar kirt dayandılar.* – [Ağasəfər] *..darvaza qabağında bir milis nəfərini görüb kirt dayandı.* Ə.Əbülhəsən.

**KİRTİK**[1] *is.* Sabun işləndikdən sonra qalan kiçik hissəsi. *Sabun kirtiyi.*

**KİRTİK**[2] *is. bayt.* Atın axsamasına səbəb olan azar. *At kirtik olmuşdur.*

**KİRVƏ** *is.* 1. Uşaq sünnət olunarkən onu tutan adam. *Uşağın kirvəsi.*

2. Yaxın adama kişiyə müraciət məqamında işlədilir. *Qasıməli kirvə, .. bizə gərək iki pud xalis inək yağı, göndərəsən.* C.Məmmədquluzadə. [Nəbi:] *Kirvə, yaxşı vaxtda gəlmisən, bir adamımız çatmırdı.* S.S.Axundov. *– Vur, köpək oğlunu, günahı çoxdur! – Deyib qızışdırır bəyi kirvəsi; Muzdurun getdikcə kəsilir səsi...* S.Vurğun.

**KİRVƏCANI** *is. məh.* Kirvə arvadına xitab, müraciət sözü.

**KİRVƏLİK** *is.* 1. Kirvə olma. [Xudaverdi:] *Bir kirvəlik paltarı keçiribdir əyninə,* [Orucun] *gözü ayağının altını görmür.* Ə.Vəliyev. *Kirvəlik hər hansı yaxın qohumdan daha yaxındır.* P.Makulu.

2. Dostluq, tanışlıq, yaxınlıq.

**KİRZA** *is.* Dəri və rezini əvəz edən maddə; dəri əvəzi.

**KİS**[1] *is. məh.* [*fars.*] Xalça, kilim, gəbə və s.-də qabarıqlıq, qırışıq, bükük.

**KİS**[2] *nida.* Qoyunları sürmək üçün çobanın işlətdiyi nida sözü.

**KİSBƏND** *is.* [*fars.*] Balaca kəsərtilər üçün gön qab, qılaf, futlyar. *Dəllək kisbəndi.*

**KİSEL** *is.* [*rus.*] Meyvə şirəsinə nişasta və s. qarışdırılmaqla hazırlanan həlməşik yemək növü. *Meyvə kiseli. Südlü kisel.*

**KİSƏ** *is.* [*fars.*] 1. Un, buğda, düyü və b. səpələnən, dağılan şeyləri saxlamaq və ya bir yerdən başqa yerə aparmaq üçün qab – torba. *Düşərgənin qabağında gübrə dolu kağız kisələr, peyin və bir neçə neft çəlləyi vardı.* M.İbrahimov. *Usta Ramazan sement və şüşə tozu ilə dolu kisələri göstərib fəhlələrə əmr verdi.* M.Hüseyn. // İçinə pul və s. qoymaq üçün kiçik torba, kisəcik. *Pul kisəsi. Bir kisə xına. – Koroğlu qocaya bir kisə qızıl verdi.* "Koroğlu". [Hacı Qara:] *Oğlum ölsün ki, dəxi kisədə tənbəki yoxdur.* M.F.Axundzadə.

2. Cib mənasında. *Nisyə girməz kisəyə.* (Məsəl). *Gecə gələn qonaq öz kisəsindən yeyər.* (Məsəl). *Sən bilirsən ki, Təbriz uşağı kef çəkəndə kisəsinin ağzını bağlamaz.* M.S.Ordubadi. *Millətin kisəsi boşdur, işi yaş,*

*ey məşədi; Ala bilmir evə bir ponza lavaş, ey məşədi!* M.Möcüz.

3. Yuyunarkən bədəndən çirki çıxartmaq üçün cod parçadan tikilən və ələ keçirilən torbacıq. ☐ **Kisə çəkdirmək** – hamamda kisəçiyə kisə ilə bədəninin çirkini çıxartdırmaq. **Kisə çəkmək** – kisə çəkərək bədənin çirkini çıxartmaq. *Miyançızadə əvvəlcə Nuriyevin uşaqlarını çimizdirdi, sonra kamali-səliqə ilə Nuriyevə kisə çəkdi və yuyundurdu.* Ə.Vəliyev.

4. *zool.* Kisəli heyvanların qarınları altında olan kisəyə oxşar boşluq (balaları bunun içində böyüyüb yetişirlər).

◊ **Kisədən getmək** – zərər dəymək, əldən çıxmaq. **Kisəsindən getmək** – itirmək, əldən çıxmaq. *O, kisəmizdən getdi.* – **...kisəsinə daş atmaq** – qəsdən pullarını xərclətmək, qurtarmaq. *Bu pulsuz vaxtımda, Mirzənin kisəmə daş atmağına müəyyən məna verə bilmədim.* Mir Cəlal. **Kisəsini doldurmaq** – hər vasitə ilə varlanmaq, cibini doldurmaq. *..Hər gələn kisəsini doldurmağa çalışır.* H.Nəzərli.

**KİSƏCİK** *is.* Kiçik kisə. *Xına kisəciyi. Tütün kisəciyi.*

**KİSƏÇƏKƏN** *is.* b a x **kisəçi.**

**KİSƏÇİ** *is.* Hamamda kisə çəkməklə məşğul olan adam; kisəkeş. [Bu qadın] *Məşədi Abbas ağa kisəçinin övrətidir.* M.S.Ordubadi.

**KİSƏÇİLİK** *is.* Kisəçinin işi, peşəsi, sənəti. *Kisəçilik etmək.*

**KİSƏDİBİ** *is.* İşləndikdən sonra qalan az miqdar şey. *Kisədibi un. Kisədibi düyü.*

**KİSƏKEŞ** [*fars.*] b a x **kisəçi**.

**KİSƏ-KİSƏ** *is.* Bir neçə kisə, kisələr dolusu, kisələrlə. *..Top-top çit, kisə-kisə qənd-çay maşından boşaldıqca adamların "sağ ol, Zəki! – səsləri ümumi bir xora dönmüşdü.* R.Rza. *İndi top-top, tay-tay parça, kisə-kisə şəkər, un, düyü daşınırdı.* Ə.Əbülhəsən. // *məc.* Çoxlu miqdarda. *..Nikolay padşah Qaçaq Nəbinin başını gətirən hər hansı adama kisə-kisə qızıl da vəd edirdi.* S.Rəhimov.

**KİSƏLƏMƏ** "Kisələmək"dən *f.is.*

**KİSƏLƏMƏK** *f.* Kisə ilə çirk çıxartmaq, kisə ilə bədənini sürtmək. [Camadar] *başladı mənim canımı ovmağa, sonra da kisələməyə.* C.Məmmədquluzadə.

**KİSƏLƏNMƏ** "Kisələnmək"dən *f.is.*

**KİSƏLƏNMƏK** *qayıd.* Bədəninə kisə sürtmək, bədəninə kisə çəkmək. // "Kisələmək"-dən *məch.*

**KİSƏLƏTDİRMƏ** "Kisələtdirmək"dən *f.is.*

**KİSƏLƏTDİRMƏK** *icb.* Bədəninə kisə sürtdürmək, kisə çəkdirmək.

**KİSƏLƏTMƏ** "Kisələtmək"dən *f.is.*

**KİSƏLƏTMƏK** b a x **kisələtdirmək.**

**KİSƏLİ** *sif.* Kisəsi olan (b a x **kisə** 4-cü mənada). *Kisəli heyvanlar.*

**KİSƏLİLƏR** *cəm zool.* Məməlilər sinfinə mənsub olub, yaxşı inkişaf etməmiş kiçik balalar doğan və onları qarınları altındakı kisədə saxlayıb böyüdən kisəli heyvanlar (məs.: kenquru, köstəbək). *Tabaşir dövrünün xırda məməli heyvanları təkamül edərək iki qrupa – kisəlilərə və ətənəli*(*lərə*) *ayrılır.* M.Axundov.

**KİSƏYİ** *is.* Nazik şəffaf parça. *2 metr kisəyi.* // Həmin parçadan tikilmiş. [Gülbadam] *ağ kisəyi köynəyinin enli qolları ilə uşağın alnındakı təri sildi.* N.Nərimanov. *Qadınlar kisəyidən nazik paltar geyib, başlarını yaylıqla örtmüşdülər.* M.İbrahimov.

**KİST** *is.* [*rus.*] Bir şeyə rəng və ya yapışqan sürtmək, yaxud sulu və ya yağlı boya ilə şəkil çəkmək üçün ucuna cod tük topası bağlanmış alət; fırça. *Müharibə günündə kəskin bir silah olur; Mənim əlimdə qələm, rəssamın əlində kist.* S.Rüstəm.

**KİSVƏT** *is.* [*ər.*] *klas.* Paltar, libas. *Çün naməyə qıldı bir nəzarə; Can kisvətin etdi parə-parə.* Füzuli. *Pəhləvanlar kisvət geyir, yağlanır; Cümlə bəzirganlar burda əylənir.* "Aşıq Qərib".

**KİŞ** *nida.* Toyuqları, quşları və s. qovmaq üçün çıxarılan səs. *Vuraram ölər, kiş deyərəm, getməz.* (Məsəl). [Qaraş xoruza:] *Kiş, kiş, öləsən, səni!* M.İbrahimov. *Kiş, kiş, qırılmışlar! – deyə, Adilə əyilib yerdən fındıq boyda bir daş götürdü, göyə, qartallara doğru tolazlamaq istədi.* Ə.Məmmədxanlı.

**KİŞİ** *is.* 1. Cinscə qadının əksi. *Arvad üzlü kişidən, kişi üzlü arvaddan əlhəzər.* (Ata. sözü). [Rüstəm bəy:] *Mən gözümün ağı-qarası olan bir qızımı, bax bu kişiyə ərə verirəm.* Ü.Hacıbəyov. *Bu gün kişilərdən daha çox arvad var idi.* T.Ş.Simurq.

2. Ər. *Onun kişisi çoxdan ölüb.* – [Cahan:] *Bəli, kişim dəllallıq edərdi.* Ü.Hacıbəyov. *..Kişisi cavan yaşında öldüyündən Durnanın həyatı pozulmuşdu.* Ə.Sadıq.

3. Adam, şəxs, kəs. *Hər kişi öz işini bilsin. Hər kişi öz sözünü dedi.* – *Hər kişinin öz münasib tayı var; İşim nədir deyəm xandan, a mirzə.* Aşıq Pəri. *Kişi dövlətinə pasiban gərək; İşarə anlayan, söz qanan gərək!* Q.Zakir.

4. *məc.* Mərd, namuslu, sözündə sabit adam. *Bu, kişiyə yaraşan hərəkət deyil.* – *Özün kişi deyən kimsə sədaqət sənətin işlər.* M.P.Vaqif. [Məşədi İbad] *..Mən deyirəm ki, axı Rüstəm bəy kişidir, belə iş eləməz.* Ü.Hacıbəyov. ☐ **Kişi kimi** – mərdliklə, namusla, mərdcəsinə, möhkəm. *Özünü kişi kimi aparmaq. Kişi kimi söz vermək.*

5. Hörmət əlaməti olaraq yaşlı kişilərin adlarına əlavə olunur. *Alı kişi neçə illər idi ki, Həsən xana ilxı otarırdı.* "Koroğlu". *Həsən kişi yeganə qızının haqqında dönə-dönə təriflər eşitmişdi.* M.İbrahimov. *Xalıqverdi kişi qocalmışdı.* Ə.Vəliyev. ☐ **Beş kişinin biri** – hörmətli, nüfuzlu kişi haqqında.

**KİŞİCİYƏZ, KİŞİCİK** "Kişi" sözündən *oxş.* [Tükəz:] *Kişiciyi tovluyub qaçaq mala apardılar.* M.F.Axundzadə. [Zərrintac:] *Guya bizim bu kişiciyin böyük bir gəmisi-zadı batıbdır!* S Rəhimov.

**KİŞİ-KİŞİ** *zərf* Kişilərə məxsus bir tərzdə, kişi kimi, yaşlı adam kimi. *Aslan baltanı götürür, kişi-kişi soba üçün odun yarırdı.* S.Rəhimov.

**KİŞİLƏNMƏ** "Kişilənmək"dən *f is.*

**KİŞİLƏNMƏK** *f.* 1. Kəkələnmək, xoruzlanmaq, cəsarətlənmək, üstünə qabarmaq. [Hacı:] *Demək ki, Sultanəli tək məni söyür, ya Məşədi Cahangirə kişilənir?* Mir Cəlal. *Ancaq Sadığın yanında özünü təhqir olunmuş sayan Kərim bir az kişiləndi.* Ə.Vəliyev.

2. B a x **kişiləşmək** 1-ci mənada.

**KİŞİLƏŞMƏ** "Kişiləşmək"dən *f.is.*

**KİŞİLƏŞMƏK** *f.* 1. Cismən yetkinləşmək, möhkəmlənmək, tamamilə boya-başa çatmaq, yekəlmək.

2. Kişi xasiyyətli olmaq, kişi kimi olmaq. *Kişilərlə yoldaşlıq edib bir vəzifə daşıdığım üçün kişiləşmədim ki!* M.S.Ordubadi.

3. B a x **kişilənmək** 1-ci mənada. *Görürsən ki, uşaqlar şitəyir, bir az yekəsi kişiləşir, onları aralayırdı.* S.Rəhimov.

**KİŞİLİ-ARVADLI** *top.* Həm kişilər, həm qadınlar; hamı. *Ya rəbbi! – deyə bu dəfə kişili-arvadlı bütün məclisdəkilər yerbəyerdən səsləndilər.* M.Rzaquluzadə.

**KİŞİLİK** *is.* 1. Qoçaqlıq, igidlik, mərdlik, mətanət, səbat, qeyrət, hünər. *Hücuma başlarkən Bədəlov taqımına demişdi: – Bax, kişilik vaxtıdır, qırdığınızı qırın, olmadı əsir tutun..* Ə.Əbülhəsən. [Fərhad] *döyüşçülərlə olduqca müxtəsər danışdı: – Hər kəsdə azərbaycanlı qanı varsa, bu gecə kişilik göstərməlidir.* Ə.Vəliyev.

2. Kişiyə xas olan sifətlər, xüsusiyyətlər. [Hacı:] *Mənim kişiliyim qalmayıb.* C.Cabbarlı. [Hacı Kamyabın] *kişiliyini yaxşı anlamaq lazım gələrsə, "arvadlar arasında kişi" sözü haqqında fikrini anlamaq gərəkdir..* Qantəmir. // Kişi heysiyyəti, mənliyi, qeyrəti. *Müqim bəyin kişiliyinə toxunan bu atmacadan o, pul kimi qızardı.* S.Rəhimov. // Kişi cinsi qabiliyyəti.

◊ **(Heç) kişilik(dən) deyil** – kişi adına yaraşmaz, insana yaraşmaz, layiq deyil. *Qəssab Alı fikirləşdi ki, bu belə danışır, bunun kefinə dəyib Eyvazı əlindən almaq heç kişilikdən deyil.* "Koroğlu". [Əmrah:] *Eh, nökərçilik də bir kişilik deyil.* Ə.Haqverdiyev.

**KİŞİSİZ** *zərf* və *sif.* Sahibsiz, ərsiz. *Kişisiz ev. Kişisiz arvad.* – *Kimdirlər .. kəbinli övrətlərini gecələr evlərdə kişisiz qoyanlar?* C.Məmmədquluzadə. *Demək, Nigar səhvini anlamış, başa düşmüşdür ki, ev kişisiz dolana bilməz.* S.Hüseyn.

**KİŞİVARİ** *sif.* Kişiyə oxşar kimi, kişi kimi. [Məşədi Kaşani:] *Görünüz iş nə mərtəbəyə çatıbdır ki, bir para ünas xeylağı kişivari paltar geyib konduktorluq və sərtiblik edir.* Qantəmir.

**KİŞİVARİLİK** *is.* Kişiyə oxşama, özünü kişiyə oxşatma.

**KİŞ-KİŞ** b a x **kiş**. *Kiş-kişlə donuz darıdan çıxmaz.* (Ata. sözü).

◊ **Kiş-kişlər olsun!** – Allah eləməsin, Allah göstərməsin, ev-eşikdən uzaq olsun. *Arvad .. samovara kömür salır, gülə-gülə əlini dizinə vurub deyir: – Kiş-kişlər olsun,*

*Səttar, başına hava-zad gəlməyib ki!* Ə.Əbülhəsən.

**KİŞLƏMƏ** "Kişləmək"dən *f.is.*

**KİŞLƏMƏK** *f.* "Kiş" deyərək toyuqları, quşları qovmaq. *Toyuqları kişləmək.*

**KİŞMİR** *is.* [Hindistandakı Kişmir şəhərinin adından] Nazik yun və ya yarımyun parça növü. *Kişmirdən şaldı səndə; Dil deyil, baldı səndə; Mən verdiyim nişana; Yadigar qaldı səndə.* (Bayatı). // Bu parçadan olan şal, örtük. *Gümüşdən ətəklik, qızıldan tana; Başda kişmir ola, tirmə şal ola.* Aşıq Bayram.

**KİŞMİRİ** *sif.* Kişmirdən tikilmiş, kişmirdən olan. *Kişmiri paltar. Kişmiri şal.*

**KİŞMİŞ** *is.* [*fars.*] Üzüm qurusu. [Qulançarı:] *Afərin bacım Zeynəb, indi otur, bunları dəstə tutaq, bazarda satıb sənə çoxlu kişmiş alacağam.* S.S.Axundov.

**KİŞMİŞİ** *is.* Tezyetişən, xırda dənəli, şirin üzüm növü.

◊ **Kişmişi gülmək** – kəsik-kəsik, xırda-xırda, yavaş səslə gülmək. [Nazlı:] *Bəxtəvər necə kişmişi gülür.* Ə.Məmmədxanlı.

**KİŞNƏK** b a x **kişnərti.**

**KİŞNƏMƏ** "Kişnəmək"dən *f.is.* // Kişnəmək səsi. *Nəbi boz atın kişnəməsinə ayılır.* "Qaçaq Nəbi". *Yavuqdan at kişnəməsi də eşidilir.* C.Məmmədquluzadə.

**KİŞNƏMƏK** *f.* 1. Kişnərti səsi çıxarmaq. *Buralardan yüyür, tez ötüş barı; İlxının kişnəyir ayğır atları.* A.Səhhət. *Kor at sahibinə yanaşıb qəmgin və titrək səslə ucadan kişnədi.* M.Hüseyn. // *məc.* At kimi səs çıxarmaq, qaqqıldamaq.

2. *məc.* Uğultu səsi çıxarmaq; uğuldamaq. *Göy kişnəyir. – Qum təpəsi kimi yeridikcə qar; Buludlar kişnədi, göylər ağladı.* S.Vurğun. *Siz yelkən açanda göylər kişnəyir; Günəş mayak olub sancılır suya.* Ə.Cəmil.

**KİŞNƏRTİ** *is.* 1. Atın çıxardığı səs; kişnəmə. *Atın kişnərtisinə bir gəlin çölə çıxdı.* Ə.Vəliyev. [Sərvinaz] *..çöldəki hənirtini alan çal atın kişnərtisini eşidirdi.* B.Bayramov.

2. *məc.* Uğultu, şiddətli səs. □ **Kişnərti salmaq** – uğuldamaq. *Güclü külək kişnərti salır, uğultu uğultuya qarışır, min bir səs bir-birinə qovuşurdu.* S.Rəhimov.

**KİŞNƏŞMƏ** "Kişnəşmək"dən *f.is.*

**KİŞNƏŞMƏK** *qarş.* Kişnəmək (eyni vaxtda bir çox at haqqında). *Mələşmir sürülər, kişnəşmir atlar; Niyə pərişandır halların, dağlar!* Aşıq Ələsgər. *Muğanda sayrışır bağlar-bağatlar; Oynaşır ilxılar, kişnəşir atlar.* S.Vurğun.

**KİŞVƏR** *is.* [*fars.*] *klas.* Ölkə, məmləkət. *Leyli məhi-asimani-həşmət; Məcnun şəhikişvəri-məlahət.* Füzuli. *Bizə çox kişvərü vilayətlər; Etdilər lütflər, inayətlər.* M.Ə.Sabir.

**KİTAB** *is.* [*ər.*] 1. Üzərində hər hansı bir mətn olan vərəqlərin bir araya gətirilərək tikilib cildlənmiş nəşriyyat növü. // Əlyazması şəklində olan bu cür əsər. *Qalın kitab. Böyük kitab. – Nə qədər ki, qamusları vərəqlədim, nə qədər ki camaat içində dolandım, "millət" sözünü nə eşitmədim, nə də bir kitabda gördüm.* C.Məmmədquluzadə. *Pul qalmadı, baxmışam hesabə; Getdi qələmə, kağız, kitabə.* M.Ə.Sabir. *Əski kitabları araşdırıb qocaman bir kitab aldım.* S.Hüseyn. // Ayrıca çap olunmuş və ya çapa hazırlanmış böyük, ya kiçik həcmli əsər. *Kitab yazmaq. Kitab nəşr etmək. Maraqlı kitab. Kitabın müəllifi.* □ **Kitab palatası** – Azərbaycanda mərkəzi biblioqrafiya idarəsinin adı.

2. Hər cür yazı üçün cildə tikilmiş kağız vərəqləri. *"Qılınc və qələm" romanı iki kitabdan ibarətdir.* □ **Kitab dili** – canlı dildən fərqli olaraq yazılı ədəbi dil üçün səciyyəvi olan dil, üslub.

◊ **Kitab açdırmaq** *din.* – Quranla fala baxdırmaq. *Aman ay molla dayı, bir kitab açdır, fala bax; Tapmasan çarəsini, sən də de ordan: "ölübə!"* M.Ə.Sabir. **Kitab açmaq** *din.* – Quranla fala baxmaq. *Abidi çağırıb dedilər: – Bir kitab aç, görək padşahın dərdi nədir?* (Nağıl). **Kitab bağlamaq** – tərifnamə yazmaq, mədh etmək. *Adına kitab bağlamaq. – Bağladım vəcdə gəlib hüsnünə şerimlə kitab; Bu yolun yolçusu tək dərdə dözüb çəkdim əzab.* S.Rüstəm. [Kərim baba:] *..Mən əgər yazı-pozu bilsəydim, gənclikdə göstərdiyim igidlikləri bir-bir yazar, böyük bir kitab bağlardım.* A.Şaiq. **Kitab bağlanmaq** – sona çatmaq, sona yetmək, iş bitmək. [Aftil:] *Bəh, bəh! Kitab bağlandı.* C.Cabbarlı. **Kitab əhli** – b a x **əhli-kitab** ("**əhl**"də). **Kitaba baxmaq** – b a x **kitab açmaq**. **Kitaba əl basmaq** *din.* – Qurana and içmək. **Kitabı bağlanmaq** – axırı olmaq, sonu çat-

maq, işi bitmək, qurtarmaq. *Artıq kitabı bağlandı. – Daha bunun kitabı bağlandı, – deyə bəzən neftçilər quyudan əllərini üzdülər.* M.Hüseyn.

**KİTABALTI** *is.* Kitabı açıq saxlamaq üçün dayaq, altlıq; rəhil.

**KİTABÇA** *is.* 1. Kiçik kitab, balaca kitab. [Pyotr] *qəzetlərin arasından bir kitabça ayırıb onlara göstərdi.* S.Rəhman. *Gülşən xeyli fikirləşdikdən sonra stolun sağ tərəfindəki kitabçanı əlinə götürdü.* Ə.Vəliyev.

2. İçərisində mətn və yazı üçün yeri olan dəftərçə şəklində bəzi sənədlərin adı. *Çek kitabçası. Əmanət kitabçası. – Əmiraslan döş cibindən əməkgünü kitabçasını çıxartdı.* S.Rəhimov.

**KİTABÇI** *is.* 1. Kitab həvəskarı, kitab sevən, kitaba həris; kitabpərəst.

2. Kitab ticarəti işçisi; kitabsatan.

3. *Sif. mənasında.* Kitab alveri ilə məşğul olan; kitabsatan. [Mirzə Qədirin] *şəhərin mərkəzində ikiqatlı evi, mətbəəsi, böyük bir kitabçı mağazası vardı.* S.Hüseyn.

**KİTABDAR** *is.* [*ər.* kitab və *fars.* ...dar] *köhn.* Kitabxanaçı, kitab saxlayan, kitabxana işçisi. *İkinci Şah İsmayılın dövründə* [Sadiq bəy Əfşar] *saray kitabxanasının xidmətçilərindən olmuş və nəhayət, Birinci Şah Abbasın kitabdarı vəzifəsini daşımışdır.*

**KİTABƏ** *is.* [*ər.*] 1. Binanın qapısı, daşlar, yaxud abidələr üzərində yazılmış və ya qazılmış yazı. *Əvvəlcə, onların Ərəbli dedikləri kəndin köhnə adı Aran kəndidir. Orada olan kitabələr və sairə də bunu isbat edir.* M.S.Ordubadi.

2. Qəbir daşları üzərində həkk edilmiş yazı.

**KİTABƏT** *is.* [*ər.*] *klas.* 1. Yazı yazma sənəti, yazma. *Əqlimi puç etdi kitabət, yazı.* Ə.Nəzmi. ☐ **Kitabət etmək** – yazmaq. *Ayrı-ayrı hərə kitabət edir; Xacələr onlara nəzarət edir.* A.Səhhət.

2. Katiblik, katib vəzifəsi.

**KİTABXANA** *is.* [*ər.* kitab və *fars.* ...xanə] 1. Ümumi istifadə üçün kitabların toplandığı və mühafizə edildiyi yer. *Kütləvi kitabxana. Məktəb kitabxanası. – Nərgiz özü isə kənd kitabxanasının müdiri olduğundan işə bir saatdan sonra gedəcəkdi.* M.Hüseyn. // Kitablar toplusu, habelə onların saxlandığı yer. *Alimin kitabxanası.*

2. Kitab saxlanan yer. *İçəri otaq kitabxanadır.*

3. Müəyyən mövzuya həsr olunmuş kitablar seriyasının adı. *Yazıçının kitabxanası.*

4. Keçmişdə: kitab mağazası.

**KİTABXANAÇI** *is.* Kitabxana işçisi. *Qoca kitabxanaçı Tahirin üzə salıb istədiyi kitabı verdi.* M.Hüseyn. *Hüquq fakültəsinin böyük və zəngin kitabxanasında kitabxanaçılar çalışıb-əlləşir, tələbələri, müəllimləri .. istədikləri kitablarla təmin edirdilər.* S.Rəhimov.

**KİTABXANAÇILIQ** *is.* Kitabxanaçı peşəsi, vəzifəsi, işi.

**KİTABİ** *is.* [*ər.*] Kitab (kvadrat) şəklində şüşə qab. *Baxma kitabi-hikmətə, mey tök kitabiyə; Çoxdan itibdir, ey ləbi-meykun, kitabımız.* S.Ə.Şirvani. // *sif.* Bu şəkildə olan. *Kitabi şüşə.*

**KİTABPƏRƏST** *sif.* və *is.* [*ər.* kitab və *fars.* ...pərəst] Kitabı çox sevən, kitaba vurğun olan, kitabdan ayrıla bilməyən (adam). *Kitabpərəst adam.*

**KİTABPƏRƏSTLİK** *is.* Kitabı, kitab yığmağı, kitab oxumağı sevmə, kitaba vurğunluq. [Zivər xanım:] [Atam] *heç axıra qədər də Məlikin bu kitabpərəstliyindən xoşlanmırdı.* S.Rəhimov.

**KİTABSATAN** *is.* Kitab satmaqla məşğul olan adam.

**KİTABŞÜNAS** *is.* [*ər.* kitab və *fars.* ...şünas] Kitabşünaslıqla məşğul olan adam, kitab tanıyan, kitabşünaslıq mütəxəssisi.

**KİTABŞÜNASLIQ** *is.* Kitablar haqqında elm.

**KİTEL** [*alm.* Kittel] Hərbi biçimdə pencək, dikyaxalı kurtka. *Pristav və yoldaşları əyləşdilər. Onlar kitellərinin yaxasını açdılar.* İ.Şıxlı. *Hələ əynində olan və onun mütənasib bədəninə, dikbaxışlı qumral gözlərinə .. çox yaraşan poqonsuz bir kitel vardı.* M.Rzaquluzadə. *Pristav kitelinin dal cibindən yekə ağ dəsmal çıxarıb pazı kimi qırmızı peysərinin tərini sildi.* Ə.Abasov.

**KİTRƏ** *is.* Bəzi ağac və kol bitkilərinin gövdələrindən axan yapışqanabənzər yarımşəffaf qatı maye. *Kolşəkilli gəvən .. cinsinin növlərindən ipək və çit sənayesi üçün qiymətli kitrə* (*yapışqanaoxşar maddə*) *alınır.* M.Qasımov.

**KİTRƏLİ** *sif.* Kitrəsi olan. *Kitrəli ağac. Kitrəli kol.*

**KİVİ** *is.* Qabığı tüklü, içi yaşıl, turşməzə meyvə.

**KİZB** *is.* [*ər.*] *klas.* Yalan, böhtan, iftira. *Kizbi özünə şüar edibsən.* Füzuli. *Nə bilim ki, .. gözəl məktubun batini kizb və böhtan ilə doludur.* C.Məmmədquluzadə.

**KLAN** *is.* [*ing.*] Qohumların bir-biri ilə təsərrüfat, maliyyə və s. əlaqələri olan, bir-birini qoruyan nəsli və ya qrupu.

**KLAPAN** *is.* Maşın motorunun hissələrindən biri.

**KLARNET** [*fr.*] Ağacdan qayrılmış, üstündə qapaq və deşikləri olan nəfəsli musiqi aləti. *Nəfəsli musiqi alətləri əsas etibarı ilə üç qrupa ayrılır: 1. ağacdan qayrılmış nəfəsli alətlər* (*fleyta, klarnet, faqot və s.*).. Ə.Bədəlbəyli. *Ustalardan biri tütək çalmağa başladı. Sonra o biri usta klarnetdə təzə havalar çaldı.* M.Hüseyn.

**KLARNETÇALAN, KLARNETÇİ** *is.* Klarnet çalan musiqiçi. *Orxan maşının yanına gələndə gördü ki, klarnetçalan Ağazəki çiynini Mirzə Muxtarın evinin tininə söykəyib, qəzet oxuyur.* İ.Məlikzadə.

**KLASSİK** [*lat.*] 1. Elm, ədəbiyyat, incəsənət sahəsində ən tanınmış, ən görkəmli və məşhur şəxsiyyət. *Böyük Azərbaycan klassikləri. – Bir azdan sonra ruscanı yaxşı öyrəndikdə, Cəfər rus klassiklərinin əsərlərini əslində oxumağa başladı.* M.Arif.

2. Ədəbiyyatda və incəsənətdə klassisizm tərəfdarı. *Klassiklərlə romantiklərin mübarizəsi.*

3. Qədim dillər (yunan və latın dilləri) və klassik filologiya mütəxəssisi.

**KLÁSSİK** *sif.* [latıncadan] 1. Klassik tərəfindən yaradılmış (b a x **klassik** 1-ci mənada), ən nümunəvi, nümunə ola biləcək. *Klassik ədəbiyyat. "Koroğlu" operası Azərbaycan musiqisinin klassik əsəridir. Klassik musiqi. – Azərbaycan klassik satirik şerinin həqiqi və ölməz yaradıcısı olan Sabir ancaq və ancaq "Molla Nəsrəddin" məktəbində tərbiyə alaraq yetişmişdir.* M.İbrahimov. // Yaradıldığı və yaşadığı vaxtdan uzun müddət keçdiyinə baxmayaraq, öz qiymətini, dəyərini, gözəlliyini itirməmiş (əsər və ya şəxs haqqında). // Tipik, çox xarakterik. *Klassik misal.*

2. Qədim yunanlara və romalılara aid olan; antik. // *Klassik dillər* (*qədim yunan və latın dilləri*).

3. Çox gözəl, nümunəvi. ☐ **Klassik gözəllik** və s. – qədim yunanlarda və romalılardakı gözəllik idealını xatırladan gözəllik və s.

4. Antik dil və ədəbiyyatının öyrənilməsi ilə bağlı olan. *Klassik filologiya. Klassik təhsil.* ☐ **Klassik gimnaziya** – inqilabdan qabaqkı Rusiyada: antik dillərin və ədəbiyyatların öyrənilməsi məcburi olan orta məktəb.

**KLASSİSÍZM** [*alm.* Klassizismus, əsli *lat.*] 1. XVII əsrdən XIX əsrin əvvəllərinə qədər ədəbiyyat və incəsənətdə: antik ədəbiyyat və incəsənətin nümunələrinə təqlid əsasında yaranan cərəyan.

2. Qədim yunan və latın dillərinin, habelə antik mədəniyyətin öyrənilməsi əsasında qurulan təhsil sistemi.

**KLAVİATÚRA** [*alm.* əsli *lat.*] 1. Musiqi alətlərində klavişlər sistemi (bütün dillər). *Royalın klaviaturası. – Klavişlərin silsilə kimi düzülmüş bütün cərgəsinə klaviatura deyilir.* Ə.Bədəlbəyli.

2. Hər hansı bir mexanizmdəki klavişlər. *Kompyuter klaviaturası.*

**KLAVİATURALI** *sif.* Klaviaturası olan. *Klaviaturalı musiqi alətləri.*

**KLAVÍR** [*alm.*] *mus.* 1. Simli klavişli musiqi alətlərinin ümumi adı (royal, pianino və s.).

2. Opera və ya simfoniya partiturasının royal üçün uyğunlaşdırılması.

**KLAVİŞ** [*lat.* clavis – açar] Fortepiano, bayan və b. musiqi alətlərində basılmaqla səs çıxardan lövhəcik; dil. *Klaviş piano, qarmon, ərğənun kimi musiqi alətlərində olan dillərə deyilir.* Ə.Bədəlbəyli. *Qaraqumda ilk dəfə səslənir pianino; Məharətlə dindirir bir gənc klavişləri.* S.Rüstəm.

**KLAVİŞLİ** *sif.* Klavişi olan. *Klavişli alətlər. Royal, piano klavişli alətlərdir.*

**KLERİKÁL** [*lat.* clericalis] 1. Ruhanilər silkinə mənsub adam; ruhani.

2. Klerikalizm tərəfdarı, klerikal partiyası (məs.: İtaliyada xristian demokratları partiyası) üzvü.

**KLERİKALÍZM** [*lat.* clericalis-dən] Feodalizm və kapitalizm şəraitində siyasi və mədəni həyatda kilsənin (dinin) təsirini gücləndirməyə və ya onu hakim vəziyyətə çıxarmağa çalışan siyasi cərəyan.

**KLERK** *is.* [*fr.*] 1. Kontor xidmətçisi.

2. *köhn.* Ruhani.

**KLİMATOLOGİYA** [*yun.* klima və logos] Yer kürəsinin müxtəlif sahələrinin iqlimlərini səciyyələndirən, təsnif edən, onların yayılmasını, iqlim əmələ gətirmə proseslərini və iqlimin coğrafi amillərini öyrənən elm; iqlimşünaslıq.

**KLİMATOLOJİ** [*yun.*] Klimatologiyaya aid, klimatologiyaya mənsub olan. *Klimatoloji müşahidələr.*

**KLİMATOLOQ** [yunancadan] Klimatologiya sahəsində çalışan alim, klimatologiya mütəxəssisi; iqlimşünas.

**KLİNİK** [yunancadan] Klinikaya aid olan, klinika ilə əlaqədar olan. *Klinik şərait.* // Klinikada aparılan. *Klinik müalicə. Klinik xəstəxana.*

**KLÍNİKA** [*yun.* klinike] Eyni zamanda tələbə məşğələləri ilə yanaşı elmi-tədqiqat işi aparılan xəstəxana tipli müalicə müəssisəsi. *Ramazan bu kimi fikirlərlə klinikanın qapısından içəri girdi.* Mir Cəlal. *Müdir klinikanın məsələlərindən ətraflı danışdı.* Ə.Vəliyev.

**KLİNİKAÇI, KLİNİST** *is.* [*yun.*] Klinikada işləyən və praktiki həkimlikdən əlavə, elmi müşahidə və tədqiqatla da məşğul olan həkim.

**KLİP** *is.* Videomaqnitofon lent yazısı.

**KLİŞÉ** [*fr.*] *mətb.* Sonradan kağız üzərində çap etmək üçün metal və ya taxta parçası üzərində qazılmış qabarıq çertyoj, plan və s. şəklinin surəti. *..Şeyxin Londonda oxuduğu zaman ingilis qiyafəsindəki rəsminin klişesini düzəltdirdik.* M.S.Ordubadi. // *məc.* Bayağı, köhnəlmiş, çeynənmiş söz və ya ifadə.

**KLUB** [*ing.*] 1. Müəyyən ictimai qrupa, peşəyə, sənətə mənsub şəxslərin birgə istirahətini, əyləncəsini, idman məşğələlərini və s. təşkil edən ictimai təşkilat. *Şahmat klubu. İdman klubu. Yazıçılar klubu.*

2. Bu təşkilatın yerləşdiyi bina. [Hüseyn:] *Mən sənə nə cür başa salım, gedirəm kluba rəqs eləməyə.* S.Rəhman. [Nuriyyə:] *Bizim məhəllədə kiçik bir klub var idi.* İ.Əfəndiyev.

**KNOPKA** [*holl.*] 1. Kağızı, parçanı və s.-ni bərk bir şeyə bərkitmək üçün yastı başlı mıxcıq. *Sadıqzadə kağızları knopka ilə bərkidən köməkçilərinə göstəriş verirdi.* S.Rəhimov. *O, knopkaları ehtiyatla çıxarır, abı yerli, zərif naxışlı divar kağızının yırtılmamasına çalışırdı.* Ə.Əbülhəsən.

2. Məftildəki elektrik cərəyanının dövranını bağlamaq və müxtəlif mexanizmləri işə salmaq üçün basma düymə. *Elektrik zənginin knopkası. – Sədr yenə bayaqkı fikirlərinə qayıtdı, əlini knopkaya dayadı, gözləmə otağında əyləşən ortaboy oğlan içəriyə girib qapı ağzında durdu.* S.Rəhimov.

**KNYAGİNYA** [*rus.*] *köhn.* Knyaz arvadı. *Bu övrət knyaginya Natella imiş.* F.Köçərli. *Hacı da knyaginyanın kefini soruşdu, dostluğuna dair sözləri yarıtürkcə, yarırusca dedi.* M.S.Ordubadi.

**KNYAJNA** [*rus.*] Ərə getməmiş knyaz qızı. *Gözəl knyajna dönərək natiqə davamlı və maraqlı bir nəzər saldı.* Lermontovdan.

**KNYAZ** [*rus.*] 1. Qədim Rusiyada: tayfa, qəbilə başçısı; qoşun rəhbəri; feodalizm inkişaf etdikcə – feodallar sinfinin yüksək nümayəndəsi, knyazlığın hakimi. *Kiyev knyazları.*

2. Çar Rusiyasında: bəzi zadəgan nəsillərinə nəslən keçən fəxri titul (XVIII əsrdən bu titul çarın fərmanı ilə də verilirdi) və bu titulu daşıyan şəxs. *Qız zənn edır, səfərdən gəlir knyaz; Birdən görür bir qonaqdır tanınmaz.* A.Səhhət. [Əhməd:] *Sən get knyazlardan xəbər al, yaranallardan xəbər al, .. onda bilərsən ki, Aslan bəy kimdir.* N.Vəzirov. [Əmiraslan ağa:] *..Mənim oğlum rusların knyaz, qraf, baron və qeyri nücəba övladlarından artıq və əzizmiş?* S.S.Axundov.

**KNYAZLIQ** *is.* 1. *tar.* Knyazın idarəsi altında olan vilayət. *O zamanlar Moskva Suzdal knyazlığının sərhədində idi.* M.İbrahimov.

2. *köhn.* Knyaz rütbəsi və hüququ. *Məğrur Troyekurov* [Vereyskinin] *knyazlıq şərəfini nəzərə alaraq knyaz Vereyskini bir dərəcəyədək özünə müsavi saydı, dəvəti qəbul etdi.* Puşkindən.

**KOAQULOQRAM** *is.* [*lat.* və *yun.*] Qan analizində qanın laxtalanması barədə qeydlər.

**KOALÍSİYA** *is.* [*lat.*] İttifaq, birləşmə.

**KOBALT** [*lat.*] *kim.* 1. Qırmızıya çalan bərk ağ gümüşü metal – kimyəvi element. *Ayrı-ayrı kimyəvi elementlərdən isə alüminium, ..sürmə, volfram, nikel, kobalt, qurğuşun və radioaktiv metalların yeni yataqlarının axtarışı xüsusi əhəmiyyət kəsb edir.* M.Qaşqay.

2. Həmin metalın oksidindən hazırlanmış tünd-göy rəngli boya.

**KOBUD** b a x **qaba.** *Kobud parça. Kobud adam. Kobud hərəkət. Kobud* (z.) *cavab vermək. – Ağca xanım zərif əlini Qaraca qıza uzatdı, o da kobud barmaqları ilə onun əlini sıxdı.* S.S.Axundov.

**KOBUDCASINA** *zərf* Kobud tərzdə, kobud şəkildə, qabacasına. [Səməd] *qabağındakı stolu kobudcasına yana itələdi, palçığa dönmüş torpaq döşəmədə iri ləpirlər qoya-qoya sürətlə çıxıb qapını çırpdı.* İ.Hüseynov.

**KOBUDLAŞDIRILMA** "Kobudlaşdırılmaq"dan *f.is.*

**KOBUDLAŞDIRILMAQ** b a x **qabalaşdırılmaq.**

**KOBUDLAŞDIRMA** "Kobudlaşdırmaq"-dan *f.is.*

**KOBUDLAŞDIRMAQ** b a x **qabalaşdırmaq.**

**KOBUDLAŞMA** "Kobudlaşmaq"dan *f.is.*

**KOBUDLAŞMAQ** b a x **qabalaşmaq.** *İşləməkdən əlləri kobudlaşıb. – Yazda və yayda havanın rütubəti zərif çay yarpaqlarını kobudlaşmaqdan qoruyur.* B.Talıblı. *Rüstəmə elə gəldi ki, arvadının əli bərkimiş və kobudlaşmışdır.* M.İbrahimov.

**KOBUDLUQ** b a x **qabalıq.**

**KOBUDYUNLU** b a x **qabayunlu.** *Kobudyunlu heyvanlar.*

**KOBUR** b a x **qobur.** *Qoçu mauzerini koburundan çıxardıb yoxladı.* M.Hüseyn.

**KÓBZA** [*türk.* "qobuz"dan] Barmaqla çalınan qədim Ukrayna musiqi aləti.

**KOD** [*fr.*] Diplomatik, hərbi və b. məlumatı teleqrafla, radio ilə vermək, siqnalizasiya və s. məqsədlər üçün işlədilən şərti işarələr sistemi. *Teleqraf kodu. Siqnal kodu. Kod ilə xəbər vermək.*

**KODAL** *is.* Vəhşi heyvanları tutmaq üçün qazılıb üstü çır-çırpı ilə örtülən çuxur yer; tələ.

**KODEÍN** [*yun.*] *əcz.* Toz şəklində öskürək dərmanı.

**KODEKS** [*lat.* codex – kitab] 1. Qanunların sistemə salınmış toplusu, məcəllə.

2. *məc.* Əxlaq, əqidə, görüş, adət normaları məcmusu.

**KOFEİN** [*hol.* koffie, əsli *ər.*] Qəhvənin, çay yarpaqlarının tərkibində olan, təbabətdə işlənən bir maddə. *Kofein yorğunluğu alıb zehni artırır və onu da artıq içmək zərərdir.* H.Zərdabi.

**KOFTA** [*rus.*] Qısa, belə qədər olan qadın üst paltarı. *Səlimnaz birdən əlini döşünə atdı, alt köynəyi ilə koftasının arasında gizlətdiyi balaca bir kağızı çıxarıb oğluna uzatdı.* M.Hüseyn. *Arvadın əynində çəhrayı ipək kofta .. vardı.* H.Seyidbəyli.

**KOFTALIQ** *sif.* Kofta üçün yararlı, kofta üçün olan.

**KOFTA-TUMAN** *is.* Kofta və tumandan ibarət qadın paltarı. [Səlimnazın] *əynində qırmızı ipəkdən kofta-tuman, ayağında yastıdaban qırmızı tufli vardı.* Ə.Vəliyev.

**KOĞA** *is. məh.* Bir şeyi tutub çəkmək üçün ucu qarmaqlı ağac; qarmaq. *Təndir koğası. Çoban koğası. Alma ağacının budağını koğa ilə əymək.* □ **Koğaya dönmək** – əyilmək, bükülmək. *Yarın həsrətindən, dünya qəmindən; Əyilib qamətim koğaya döndü.* Molla Cümə.

**KOĞUŞ** *is.* Böyük ağacların gövdəsi içindəki boşluq. *Güllü qız meşədə ağlaya-ağlaya gəzirdi. Gəldi, bir ağac koğuşu tapdı, oranı özünə məskən elədi.* (Nağıl). *Ağacın geniş koğuşunda yay fəsli çayçı Mürsəl bir neçə xalça salıb çay satardı.* Ə.Əbülhəsən.

**KOĞUŞLANMA** "Koğuşlanmaq"dan *f.is.*

**KOĞUŞLANMAQ** *f.* Koğuş əmələ gəlmək, koğuş açılmaq.

**KOĞUŞLU** *sif.* Koğuş əmələ gəlmiş, koğuşu olan. *Koğuşlu ağac.*

**KOKAİN** [*isp.*] Koka bitkisinin yarpaqlarından alınan narkotik və ağrıkəsən zəhərli maddə.

**KOKAİNÇƏKƏN, KOKAİNÇİ** *is.* Kokain çəkən adam, kokain düşkünü.

**KOKAİNİZM** [*isp.* cocaina-dan] Kokainə mübtəla olma, kokain düşkünlüyü. // Daima

kokaindən zəhərlənmə nəticəsində əmələ gələn ruhi xəstəlik.

**KOKAİNLİ** *sif.* Kokaini olan, tərkibində kokain olan.

**KOKARDA** [*fr.*] Rəsmi papaqlara vurulan müəyyən formada nişan.

**KOKARDALI** *sif.* Kokarda taxılmış, kokardası olan. *Kokardalı furajka. – Axar suyun üzündə; Kokardalı göy şapkalar.* S.Vurğun.

**KÓKKLAR** [*yun.* kokkos-dan] *tib.* Birhüceyrəli yumru orqanizmlər (bakteriyalar).

**KOKÓS** *is.* [*isp.*] 1. Hind qozu ağacı.

2. Hind qozu.

**KOKS** [*alm.*] Hava daxil olmadan közərdilmə yolu ilə daş kömürdən, torfdan və s.-dən alınan bərk yanacaq növü.

**KOKSLAMA** "Kokslamaq"dan *f.is. Kokslama prosesi.*

**KOKSLAMAQ** b a x **kokslaşdırmaq.**

**KOKSLAŞDIRILMA** "Kokslaşdırılmaq"-dan *f.is.*

**KOKSLAŞDIRILMAQ** *məch.* Koksa çevrilmək (daş kömür, torf və s.).

**KOKSLAŞDIRMA** "Kokslaşdırmaq"dan *f.is.*

**KOKSLAŞDIRMAQ** *f.* Koksa çevirmək (daş kömürü, torfu və s.).

**KOKSLAŞMA** "Kokslaşmaq"dan *f.is. Kokslaşma qabiliyyəti. Kokslaşma dərəcəsi.*

**KOKSLAŞMAQ** *f.* Koksa çevrilmək (daş kömür, torf və s.). *Bu kömür yaxşı kokslaşır.*

**KOKTÉYL** [*ing.* coctall – xoruz quyruğu] Müxtəlif spirtli içkilərə ədviyyat, meyvə şirəsi, qənd və s. qatılmış spirtli içki. // Müxtəlif quru meyvə şirələrində həll olunmuş dondurma halında sərinlədici içki.

**KOL** *is.* Torpaqdan qol-budaq şəklində ayrılan alçaq, ağacaoxşar bitki. *Yasəmən kolu. Qaratikan kolu. Çay kolu. Nar kolu. – Kolların və ağacların budağı arasında oxuyan quşlar da yuvalarına çəkilməkdə idilər.* H.Nəzərli. [Səməd] *çəpərin kölgəsində yaşıl qalmış nar kollarının dibinə arx çəkdi, suvardı.* İ.Hüseynov. ☐ **Kola yatmaq (girmək)** – kolun dalında və ya içində gizlənmək. [Cuma] *ara qarışdığından və çaxnaşmadan istifadə edərkən ancaq hara gedəcəyini bilmədən dayanıb kola yatdı.* Ə.Əbülhəsən.

◊ **(Bu kol) sən (o) girən kol deyil** – sən (o) bacaran iş deyil, sənin (onun) hünəri deyil, sən bacarmazsan (o bacarmaz). [Hacı Murad:] *İmran da istədi ki, atası Şeyx Əlidən qalan malı məndən istəsin, gördü ki, xeyr, o, girən kol deyil.* S.S.Axundov. [Dilbər xanım:] *Cəbi, bu kol sən girən kol deyil ha, özünü gözlə!* N.Vəzirov.

**KOLA** *sif.* Gödək buynuzu olan; gödəkbuynuz. *Kola keçi.* – [Ataş:] *Atalar sözüdür ki, kola qoçun qisası buynuzlu qoçda qalmaz.* Ə.Vəliyev.

**KOLABUYNUZ(LU)** *sif.* Buynuzu gödək olan, buynuzu qısa. *Kolabuynuz qoyun. – Yusif yəhərinin tərkində dolu xurcun olan qəmər madyanı tərpədib, kolabuynuz inəyi qabağına qataraq kəndə tərəf sürdü.* Ə.Abasov.

**KOLAHÜRƏN** *sif. dan.* Boş yerə hürən, boş-boşuna hürən (it haqqında). [Məşədi Cahangir:] *..Kolahürən köpəklər kimi ağzını yuxarı tutdu.* Mir Cəlal. // *məc.* Qışqırıqçı, bərkdən danışan.

**KOLAVAT** *is. məh.* Əkin əkmək üçün kol-kosu yandırılıb təmizlənmiş yer. *Kolavat yerin taxılı yaxşı olar.*

◊ **Kolavat kösövünə dönmək** *dan.* – çox işləməkdən, əziyyət çəkməkdən arıqlamaq, zəif düşmək, pis günə qalmaq.

**KOLAZ** *is.* Dibi yastı ensiz qayıq. *Soyuq havada dəniz və ya göldə ördək dəstələrini ovlayan ovçu kiçik qayıq və ya kolazı yaxşı sürə bilməlidir.* M.Rzaquluzadə.

**KOLAZÇI** *is.* Kolaz qayıqçısı.

**KOLBA** [*alm.*] Kimya laboratoriyalarında mayeləri qızdırmaq üçün işlədilən dar uzun boğazlı, adətən girdə və ya konusşəkilli şüşə qab.

**KOLBACIQ** *is.* Balaca kolba, kiçik kolba.

**KOLBASA** *is.* [*rus.* əsli *türk.*] Xüsusi surətdə qiymə edilmiş ətdən hazırlanaraq bağırsaq və ya su keçirməyən süni şəffaf qabığa bükülmüş yeyinti məhsulu. *Kolbasa istehsalı. Kolbasa sexi. Mal ətindən kolbasa. Qoyun kolbasası. Mindik maşınlara, təyyarələrə; Verdik kolbasaya biz Qıratları... Həmişə irəli! Geri dönmədik.* B.Vahabzadə.

**KOLBASAÇI** *is.* Kolbasa hazırlayan adam. // *köhn.* Kolbasa satan adam.

**KOLBASALIQ** *sif.* Kolbasa üçün yararlı, kolbasa üçün ayrılmış. *Kolbasalıq ət.*

**KOLBASAR** b a x **kolluq.**

**KOLÇEDAN** Bəzi metalların (dəmir, nikel, mis və s.) sürmə, kükürd, arsenlə birləşməsindən ibarət mineralların ümumi adı. *Respublikamızın faydalı qazıntıları içərisində pirit və ya kükürd kolçedanı yataqları görkəmli yer tutur.* M.Qaşqay.

**KOLÇEDANLI** *sif.* Tərkibində kolçedan olan. *Kolçedanlı süxurlar.*

**KOLENKOR** [*fr.*] Yapışqan hopdurulmuş ağ və ya birrəngli pambıq parça növü. // Kolenkordan qayrılmış (tikilmiş). *Kolenkor cild. Kolenkor köynək.*

**KOLXORUZU** *is. məh.* Qırqovul.

**KOLXOZ** *is. tar.* [*rus.* "коллективное хозяйство" söz. ixtisarı] Kollektiv təsərrüfat – SSRİ-də iri, yüksək səviyyədə mexanikləşdirilmiş kənd təsərrüfatını elliklə aparmaq üçün XX əsrin 30-80-ci illərində kənd zəhmətkeşlərinin sosialist tipli istehsal birləşməsi; kənd təsərrüfat arteli. *Qabaqcıl kolxoz.* – [*Fərman*] *gözünü açarkən özünü kolxozda görmüşdü.* Ə.Sadıq. ☐ **Kolxoz bazarı** – kənd zəhmətkeşlərinin öz həyətyanı təsərrüfatlarından götürdükləri və öz şəxsi ehtiyaclarından artıq qalan kənd təsərrüfatı məhsullarını satdıqları bazar.

**KOLXOZÇU** *is. tar.* Kolxoz üzvü olan kəndli, kolxoz üzvü. *Arabanı sürən qısaboy, yoğun bir kolxozçu idi.* M.Hüseyn. *Maşın bir dəstə kolxozçunun yanından keçdi.* S.Rəhman. *Qara kişi də kolxozçuların çoxu kimi .. işləyir*(*di*). Ə.Əbülhəsən.

**KOLXOZLAŞDIRMA** "Kolxozlaşdırmaq"-dan *f.is.*

**KOLXOZLAŞDIRMAQ** *f. dan.* Kollektivləşdirmək, elliklәşdirmək (kənd təsərrüfatının istehsal vasitələrini).

**KOLXOZLAŞMA** *dan.* "Kolxozlaşmaq"-dan *f.is.* [Bayram:] *Murad, bilirsən ki, kolxozlaşma vaxtı mən çox əziyyət çəkmişəm.* Ə.Vəliyev. *Bu heyrətə səbəb, demək olar ki, hamısı kolxozlaşmadan sonra tikilən üstü qırmızı kirəmitli evlər deyildi..* İ.Əfəndiyev.

**KOLXOZLAŞMAQ** *f. dan.* Kollektiv təsərrüfatda birləşmək; kollektivləşmək, elliklәşmək (kənd təsərrüfatının istehsal vasitələri haqqında).

**KOLİ́T** [*yun.* colon – yoğun bağırsaq] *tib.* Yoğun bağırsağın iltihabı.

**KOLİTLİ** *sif.* Koliti olan.

**KOL-KOS** *top.* 1. Bir-birinə qarışmış, dolaşmış müxtəlif kollar; kolluq. *İlanlar fışıldayır kol-koslar arasında.* S.Rüstəm. *Bəzi yerləri qalın kol-kos basmışdı.* M.Rzaquluzadə.

2. *məc.* Zir-zibil, yararsız, lazımsız şeylər mənasında.

**KOL-KOSLU** *sif.* Kol-kos olan, kol-kos basmış. *Kol-koslu dərə* (*cığır*). – *Mərkəzdən uzaq .. kol-koslu, ilan-çayanlı bir düzdə Güllücə kəndi bina olunmuşdur.* S.S.Axundov.

**KOL-KOSLUQ** *is.* Kol-kos basmış yer; kolluq. *Qayanın dibi yaman kol-kosluq idi.* "Koroğlu". *Kəhər ağzını palçıqlı cığırdan kol-kosluğa saldı.* M.İbrahimov. *Hər tərəf ağaclıq və kol-kosluqla örtülü idi.* S.Vəliyev.

**KOLQIRAN** *is. xüs.* Kolları çıxaran və doğrayan maşın.

**KOLQOTQA** *is.* [*rus.*] Tuman və corabdan ibarət uşaq və ya qadın geyimi.

**KOLLAMA** "Kollamaq"dan *f.is.*

**KOLLAMAQ** *f.* Kolla örtmək, koldan çəpər çəkmək. *Tayanın ətrafını kollamaq.*

**KOLLANMA** "Kollanmaq"dan *f.is.*

**KOLLANMAQ** *f.* 1. Kolla örtülmək, kol basmaq.

2. Kol şəklini almaq, kol kimi olmaq. *Nar ağacı kollanıb.*

**KOLLAŞMA** "Kollaşmaq"dan *f.is.*

**KOLLAŞMAQ** b a x **kollanmaq.**

**KOLLÉJ** [*ing.* college] Bir sıra xarici ölkələrdə orta və ya ali məktəb.

**KOLLEGİAL** *sif.* [*lat.* collegium-dan] Kollegiya (bir qrup şəxs) tərəfindən həyata keçirilən. *Kollegial rəhbərlik. Məsələnin kollegial surətdə həll edilməsi.*

**KOLLEGİALLIQ** *is.* İşi təkbaşına deyil, kollegial surətdə (birgə) idarə və həlletmə prinsipi.

**KOLLÉGİYA** [*lat.* collegium-dan] 1. İnzibati, məşvərətçi və ya sərəncamçı orqanı təşkil edən vəzifəli şəxslərdən ibarət heyət. *Maarif Nazirliyinin kollegiyası. Kollegiyanın qərarı.*

2. İnqilabdan qabaqkı Rusiyada: bəzi mərkəzi hökumət idarələrinin adı.

**KOLLEKSİONER** [*lat.*] b a x **kolleksiyaçı.**

**KOLLEKSİONERLİK** b a x **kolleksiyaçılıq.**

**KOLLEKSİYA** [*lat.*] Elmi, bədii və tarixi əhəmiyyəti olan şeylərin müəyyən sistem üzrə düzülmüş toplusu. *Qədim pullar kolleksiyası. Minerallar kolleksiyası. Markalar kolleksiyası. – Yay gecələri lampa işığına gələn cücüləri də yığıb saxlamaq, üzərində müşahidə aparmaq və bəzilərindən kolleksiya hazırlamaq faydasız olmaz.* C.Cəbrayılbəyli. *Darvin .. çoxlu minerallar, bitkilər və cücülər yığıb səliqə ilə onlardan kolleksiya hazırlayırdı.* M.Axundov.

**KOLLEKSİYAÇI** *is.* Kolleksiya toplayan, kolleksiyaçılıqla məşğul olan. *Marka kolleksiyaçısı.*

**KOLLEKSİYAÇILIQ** *is.* Bir məşğələ kimi kolleksiya toplama məşğuliyyəti.

**KOLLEKTÍV** [*lat.*] Ümumi məqsəd, yaxud birgə işləmək üçün birləşmiş adamlar toplusu. *Elmi kollektiv. Bədii özfəaliyyət kollektivi. Vahid bir kollektiv yaratmaq.* – [Almaz:] *Gərək ellik varlansın, kollektiv varlansın.* C.Cabbarlı. // Bir müəssisə, idarə və ya təşkilatın tərkibinə daxil olub həmişə bir yerdə işləyən adamlar qrupu. *İnstitutun kollektivi. Müəllim kollektivi. Zavodun kollektivi.* – [Qoşqar:] *Büronun, kollektivin rəyi ilə hesablaşmaq lazımdır.* Mir Cəlal. // *sif.* və *zərf* mənasında. Ümumi, birgə. *Kollektiv iş. Kollektiv rəhbərlik. Kollektiv işləmək. Kollektiv surətdə müzakirə* etmək. ☐ **Kollektiv müqavilə** – əmək şəraiti haqqında həmkarlar ittifaqı ilə idarə, müəssisə və s. müdiriyyəti arasında bağlanan müqavilə. **Kollektiv təsərrüfat** – b a x **kolxoz.**

**KOLLEKTİVÇİ** *is.* Kollektivizmin ardıcıl tərəfdarı.

**KOLLEKTİVÇİLİK** *is.* Kollektivi sevmə, həmişə kollektiv içərisində olma. *Kollektivçilik hissi. Kollektivçilik psixologiyası.*

**KOLLEKTİVİST** b a x **kollektivçi**.

**KOLLEKTİVİZM** [*lat.*] Şüurlu surətdə şəxsi mənafeyi ictimai mənafeyə tabe etmək əsasında ümumilik və yoldaşcasına əməkdaşlıq prinsipi; kollektivçilik.

**KOLLEKTİVLƏŞDİRİLMƏ** "Kollektivləşdirilmək"dən *f.is. Kənd təsərrüfatının kollektivləşdirilməsi.*

**KOLLEKTİVLƏŞDİRİLMƏK** *məch.* Kollektivləşdirmə həyata keçirilmək, kollektivin malı edilmək.

**KOLLEKTİVLƏŞDİRMƏ** "Kollektivləşdirmək"dən *f.is. Kənddə kollektivləşdirmə. Kollektivləşdirmə uğrunda mübarizə.*

**KOLLEKTİVLƏŞDİRMƏK** *f.* Kollektivləşməni həyata keçirmək, kollektivin malı etmək, kolxozlarda birləşdirmək. *Kənd təsərrüfatını kollektivləşdirmək.*

**KOLLEKTİVLƏŞMƏ** "Kollektivləşmək"-dən *f.is. tar.* Kolxozlarda birləşmə, sosializm prinsipləri əsasında ümumiləşmə. *Kənddə kollektivləşmə. Kollektivləşmə işinə rəhbərlik etmək.*

**KOLLEKTİVLƏŞMƏK** *f.* Kollektivləşmə həyata keçmək, kollektivin malı olmaq; kolxozda birləşmək.

**KOLLEKTİVLİK** b a x **kollektivizm.**

**KOLLÉKTOR** [*lat.*] 1. *xüs.* Bir şeyi öz tabeliyində olan təşkilatlardan toplamaq, habelə onların arasında paylaşdırılmaqla məşğul olan idarə. *Kitabxana kollektoru.*

2. *tex.* Başqa kanal və ya borulardan gələn maye və ya qazları toplayıb aparan böyük kanal və ya boru. *Kanalizasiya kollektoru.*

3. *tex.* Dinamomaşının dəyişən elektrik cərəyanını daimi cərəyana çevirən hissəsi. *Dinamomaşının kollektoru.*

4. Faydalı qazıntı, torpaq və s. nümunələrini toplayan, onların təsvirini verən və qoruyub saxlayan adam.

**KOLLEKTORLU** *sif. tex.* Kollektoru olan (b a x **kollektor** 2 və 3-cü mənalarda).

**KOLLÓİD** [*yun.* kolla – yapışqan və eidos – bənzər] *kim.* Məhlulu üzvi pərdələrdən keçməyən, kristallaşmayan maddə (zülal, nişasta, yapışqan və s.).

**KOLLOİDAL** *sif.* [*yun.* kolla və eidos-dan] *kim.* Kolloidə xas olan, kolloid xassələrinə malik olan. *Kolloidal məhlul. Kolloidal maddə.*

**KÓLLOKVİUM** *is.* [*lat.*] 1. Tələbələrin bilik səviyyəsini yoxlamaq üsullarından biri (semestr ortası).

2. Məruzələrin müzakirə məclisi.

**KOLLU** *sif.* Kol basmış, kol çox olan. *Kollu yer. Kollu yamac.*

**KOLLU-KOSLU** b a x **kol-koslu.** *Kəndarası kollu-koslu və dərəli-təpəli boşluqdan kolxoz həyatinə uzanan cığırın başında bəstəboylu bir qız göründü.* M.İbrahimov.

**KOLLUQ** *is.* Kollardan ibarət sahə; kolu çox olan, kol basmış yer. *Kolluğu qırmaq. Kolluqda gizlənmək.* [Tarverdi:] *Mənim kolluq içində iki yüz yoldaşım yatır.* M.F.Axundzadə. *..Sıx kolluqdan yavaş-yavaş baharın dirçəldib dilə gətirdiyi quşların pıçıltısı ucalırdı.* Ə.Əbülhəsən. // Sif. mənasında. *Kolluq sahə. – Abbas qulançar yığa-yığa çəməndən xeyli uzaqlaşıb bir kolluq dərəyə düşmüşdü.* S.S.Axundov. *Dəhnənin yuxarı tərəfi kolluq, qayalıq bir yer idi.* Ə.Vəliyev.

**KOLODKA** *is.* [*rus.*] Fəxri nişanları paltara sancmaq üçün lövhəcik.

**KOLONİALİZM** [*lat.*] b a x **müstəmləkəçilik.**

**KOLONİST** [*lat.*] Koloniyada yaşayan adam (b a x **koloniya** 2-ci mənada).

**KOLONİYA** [*lat.*] 1. B a x **müstəmləkə**.

2. Bir dövlətin ərazisində əcnəbilərin və ya bir ölkədə başqa yerdən köçüb gələnlərin yaşadığı yer, məhəllə, qəsəbə. // Bu həmyerlilərin başqa ölkədə, yerdə təşkil etdikləri icma.

3. Bu və ya başqa məqsədlə (islah edilmək, işləmək, müalicə olunmaq və i.a.) köçürülmüş adamların yaşadığı yer. *Əmək koloniyası.*

4. *biol.* Bir-biri ilə bitişik yaşayan orqanizmlər qrupu. *Mikroblar koloniyası. Süngərlər koloniyası.*

**KOLONKA** [*rus.*] *xüs.* Vanna otağında suyu qızdırmaq üçün silindrşəkilli qazan.

**KOLONNA** [*fr.*] Müəyyən qayda ilə düzülüb bir-birinin ardınca hərəkət edən insan, maşın və s. dəstəsi, cərgəsi; qol, səf, sıra. *Tank kolonnası. Avtomaşın kolonnası. Nümayişçi kolonnası. – Traktor kolonnası yaxınlaşdıqca izdihamın toplaşdığı düzə projektor kimi işıq salırdı.* M.Hüseyn.

**KOLORİST** [*fr.* coloriste, əsli *lat.* color-dan] Rəngləri bir-birinə yaxşı uyğunlaşdıran və onlardan istifadə etməyi bacaran rəssam; kolorit ustası olan rəssam.

**KOLORİT** [*ital.* colorite, əsli *lat.* color] 1. Şəkildə, rəngli qravürada, mozaikada və s.-də rənglər, tonlar arasında əlaqə, münasibət, uyğunluq. *Şəklin koloriti.* // Rəng, rəng çaları.

2. *məc.* Xüsusiyyət, bir şeyin özünə məxsus xüsusiyyəti. *Natəvanın portreti parlaq milli xüsusiyyətlərə malikdir. Bu milli kolorit .. portretin zahiri görünüşündə – şairənin geyimində və naxışlı ipək örpəyində hiss olunur.* (Qəzetlərdən).

**KOLORİTLİ** *sif.* Koloriti olan, müəyyən koloritə malik; koloriti, xüsusiyyəti bariz surətdə özünü göstərən. *Koloritli tamaşa.*

**KOLPAN** *sif. məh.* Qollu-budaqlı, şaxəli, çoxlu xırda qol-budağı olan. *Kolpan kol.* // İs. mənasında. *Divarlara o qədər gül-çiçək taxılıb ki, elə bil hər bir divarda kolpanlar bitib.* Ə.Vəliyev.

**KOLPANLI** *sif. məh.* Kolpanı olan, kolpan bitmiş. *Rüstəm .. buraya qalxıb kolpanlı ağacın dibində durdu.* S.Rəhimov.

**KOLŞƏKİLLİ** *sif.* Kol şəklində olan, kol şəklində bitmiş, kola oxşayan; kolvari.

**KOLT** [*ing.* xüs. addan] Xüsusi sistemli tapança, ya pulemyot. *..Onların da kəmərində kolt sistemli tapançalar vardı.* M.S.Ordubadi. *Koltunu döş cibindən; Nə vaxt çıxartdığını; Heç bilmədi Ben-Osman.* B.Vahabzadə.

**KOLVARİ** b a x **kolşəkilli.**

**KOLYURİYA** *is.* [*fr.*] Fəza sferasının iki böyük sferasının adı.

**KOM** *is. dan.* Dəstə, yığın. *Qız oğlanı qırx kom çubuq sınınca çırpdı.* (Nağıl).

**kom-kom** *zərf* Dəstə-dəstə, kol şəklində, kol-kol. *Damda kom-kom qanqal, sirkan bozarırdı.* İ.Hüseynov.

**KOMA**[1] *is.* Səpələnən, dağılan şeylərin təpə halında yığımı; topa, qalaq. *Qum koması. Torpaq koması. – Hərənin qabağında bir zorba koma kül qalandı.* C.Məmmədquluzadə. □ **Koma vurmaq** – qalaq vurmaq, bir yerə yığmaq; toplamaq. *Samanı koma vurmaq.*

**koma-koma** *zərf* Yığın-yığın, topa-topa, dəstə-dəstə, üst-üstə yığılmış halda. *Şərqə*

*doğru ağır-ağır, koma-koma uçuşan buludlar birləşir, şəhəri get-gedə qorxunc bir qaranlıq almağa başlayırdı*. A.Şaiq. *Əsgərlərin çoxu qar üstündə dövrələmə oturmaqdansa bu çuxura girməyi məsləhət bilib, birər-ikişər koma-koma .. otururdular.* Ə.Əbülhəsən.

**KOMA$^2$** *is.* Primitiv ev, daxma, daxal. *Sığınıb dağda yapılmış komaya insanlar; Dırmaşır sərt qayalar üzrə bütün heyvanlar.* A.Səhhət. *Bu əhvalatdan sonra Nadirəni komada əliboş görmək olmazdı.* Mir Cəlal. *Az keçmədi gəlinlər gəlib onun komasını suladılar, su dolu bir sənək gətirdilər.* Ə.Məmmədxanlı. // Ümumiyyətlə, təvazölə və ya zarafatla “ev” mənasında. *Oturub ac komasında atamın; Biş-düşün hazır edərdim anamın.* M.Ə.Sabir. [Əlləzoğlu:] *Qız mənim komamda nə görüb ki?* İ.Hüseynov.

◊ **Qiraət koması** – kənddə mədəni maarif ocağı. [Cahan:] *Hər yerdə qiraət koması açılır..* Ə.Haqverdiyev. *Çox yerdə klub, qiraət koması, kitabxananın işləri qənaətləndirici deyildir.* Ə.Sadıq.

**KÓMA** [*yun.*] *tib.* Bəzi xəstəliklər nəticəsində özündəngetmə, reflekslərin qan dövranının, tənəffüsün, mübadilə prosesinin pozulması şəklində təzahür edən ağır hal. *Koma vəziyyəti.*

**KOMACIQ** “Koma” söz *kiç.*

**KOMALAMA** “Komalamaq”dan *f.is.*

**KOMALAMAQ** *f.* Koma vurmaq, bir yerə yığmaq, üst-üstə yığmaq; qalaqlamaq, toplamaq. *Qumu komalamaq. Taxılı komalamaq.* – [Ələmdar] *dəyirmi stolun üstü ilə səpələnən kağızları əli ilə sivirib komaladı.* S.Rəhimov.

**KOMALANMA** “Komalanmaq”dan *f.is.*

**KOMALANMAQ** *məch.* və *qayıd.* Koma vurulmaq, koma halına salınmaq, üst-üstə yığılmaq, bir yerə toplanmaq; qalaqlanmaq. *Payız buludları seyrək-seyrək komalanıb aşağı yığılır, havanın rütubəti artıb soyuduğu daha çox duyulurdu.* Ə.Əbülhəsən.

**KOMALAŞMA** “Komalaşmaq”dan *f.is.*

**KOMALAŞMAQ** *f.* Bir yerə yığılmaq, toplaşmaq, yığışmaq. *Uşaqlar həyətdə komalaşdılar.* – [Kitabsatan:] *Camaat, burada komalaşmayın, görən deyəcək, görəsən, yenə nə hürriyyətbazlıqdır*. Mir Cəlal. *Turac, kəklik, qırqovul da; Komalaşıb durdu yolda.* M.Dilbazi.

**KOMALIQ** *is.* Koma olan yer; koma, topa, qalaq vurulmuş yer. *Bahadır dəftərcəsini xeylaq yazandan sonra meşədə gəzirdi. Komalıqda gəzərkən nəzəri bir ağacın altına düşdü.* N.Nərimanov.

**KOMANDA** *is.* [*fr.* kommande, *lat.* commandare-dən] 1. Komandirin, başçının müəyyən edilmiş qaydada qısaca şifahi əmri. *Komandanı yerinə yetirmək. Hücum komandası. – Adamlar elə bil ümumi komanda ilə Tahirə sarı baxdılar.* M.Hüseyn. // Ümumiyyətlə, amiranə tərzdə qısaca verilən əmr, sərəncam.

2. Hər hansı bir hərbi hissədə başçılıq, komandanlıq. *..Mədədov Bədəlovun komanda etdiyi taqıma, Hacıyev isə Xolmoqortsevin taqımına getdi.* Ə.Əbülhəsən. ☐ **Komanda məntəqəsi** – komandirin təlim və ya döyüş zamanı duraraq öz hissəsini idarə etdiyi xüsusi düzəldilmiş yer. *Novruz batareya komandirinə tapşırıq verib komanda məntəqəsinə tərəf süründü.* R.Rza.

3. Əsgəri hissə, dəstə, yaxud xüsusi vəzifə daşıyan kiçik hərbi hissə. *Pulemyot komandası. Keşikçi komandası.*

4. Gəmi heyəti, onun bütün qulluqçuları. *Gəmi komandası.* // Hər hansı bir vəzifəni yerinə yetirən adamlar heyəti. *Yanğın komandası.*

5. Eyni bir idman növü ilə məşğul olan idmançılar dəstəsi, kollektivi. *“Neftçi” futbol komandası. Güləşçilər komandası. Qadın basketbol komandası.*

**KOMANDAN** [*alm.* kommandier-dən] b a x **komandir**. *Cavan komandanın da qocanın bu halətinin təsirindən gözləri yaşardı.* Ə.Haqverdiyev. [Qəhrəman:] *Bundan əlavə, komandan bir-iki saata qədər bizə kömək göndərəcəyinə də söz vermişdi.* H.Nəzərli.

**KOMANDANLIQ** *is.* 1. B a x **komandirlik** 1-ci mənada.

2. *top.* Qoşunların, hərbi hissələrin və s.-nin başında duran komanda heyəti. *Cəbhə komandanlığı. – Hərbi təlim dövründən sonra atıcı diviziyası yoxlanıldı və komandanlığın əmri ilə bir baş cəbhəyə getdi.* S.Rəhimov.

**KOMANDİR** [*alm.*] 1. Hərbi hissə, birləşmə, ya hərbi gəmi başçısı. *Polk komandiri. Rota komandiri. Gəmi komandiri. – Komandirin bu əmrinə kimsə etiraz etmədi.* S.Hüseyn. *Sən bu gündən komandirsən, mən isə sənin komissarın.* S.Vəliyev.

2. İstehsalat rəhbərlərinə (mühəndislərə, texniklərə) məcazən verilən ad. *İstehsalat komandirləri.*

**KOMANDİRLİK** *is.* 1. Komandir vəzifəsi. *Komandirlik kursu. – Hacıyev orta rütbəli komandirlikdən hələ bugünkü qədər inciməmişdi.* Ə.Əbülhəsən.

2. B a x **komandanlıq** 2-ci mənada *Komandirliyin əmri.*

**KOMBAYN** [*ing.*] Taxıl və texniki bitkilərin yığımında eyni zamanda bir sıra işi görən kənd təsərrüfatı maşını. *Taxıl kombaynı. Kartofyığan kombayn. Kombayn sürmək. – Geniş bir binanın şiferlə örtülmüş taxtapuşu, altında çoxlu traktor, kombayn vardı.* M.İbrahimov. *Parlaq günəş işığında sarı buğda zəmilərinin içindəki kombaynlar dənizdə üzən balaca gəmiləri xatırladırdı.* İ.Əfəndiyev. *Fərəc kişi dinməz-söyləməz kombayna qalxdı.* Q.İlkin. // Kömür, süxur və s. çıxarılmasında eyni zamanda bir neçə işi görən mürəkkəb maşın. *Kömür kombaynı. Torf kombaynı.*

**KOMBAYNÇI** *is.* Kombayn işlədən fəhlə, kombayn sürən. *Kombaynçı ixtisası. Kombaynçıların yarışı. – Kombaynçı mat-məəttəl kolxoz sədrinə və qaya kimi lal-kar duran kombayna baxırdı.* Ə.Əbülhəsən. [Sevinc Sonaya:] *..Taxılbiçən bir kombaynçı .. biçin yerini öyrənməmiş işə başlamır.* Z.Xəlil.

**KOMBAYNÇILIQ** *is.* Kombaynçının işi, peşəsi, sənəti. *Kombaynçılıq kursu.*

**KOMBİNASİYA** [*lat.*] 1. Müxtəlif və ya eynicinsli şeylərin bu və ya başqa qaydada üzrə düzülüşü, birləşdirilməsi. *Rəqəmlərin kombinasiyası. Səslərin kombinasiyası.*

2. *məc.* Bir məqsədə çatmaq üçün işlədilən mürəkkəb üsullar sistemi, kələkbazlıqla qurulan işlər, hadisələr. [Sultan:] *Bütün bu kombinasiya da ancaq sənə aparatda yer eləməkdən ötrüdür.* İ.Hüseynov.

3. *idm.* Oyunda üstünlük, qələbə əldə etmək üçün tətbiq edilən cürbəcür üsullar, tədbirlər. *Şahmat kombinasiyası. Futbolçuların kombinasiyası. Kombinasiya düzəltmək.*

4. Paltarın altından geyilən uzun köynək şəklində alt qadın paltarı. *İpək kombinasiya. Qara kombinasiya.*

**KOMBİNAT** [*lat.* combinare – birləşmiş] 1. Texnoloji proses cəhətdən bir-birilə bağlı olan bir neçə müəssisəni birləşdirən iri sənaye müəssisəsi, yaxud texnoloji cəhətdən bir-biri ilə bağlı olmayan bir sənaye sahəsinə aid müəssisələrin inzibati birləşməsi. *Süd-ət kombinatı. – ..İpəktoxuyan kombinatda yüzlərlə ixtisaslı fəhlə çalışır.* S.Rəhman. *Bizə ət kombinatından belə bir ərzə gəlib; Ki, soyuqdan üşüyən mal-qaralar qeyzə gəlib.* Ə.Vahid. // Yerli sənayedə xırda istehsalatlar, yaxud məişət xidməti müəssisələri birləşməsi. *Rayon sənaye kombinatı. Məişət xidməti kombinatı.*

2. Zavod və müəssisələr yanında müxtəlif dərəcəli məktəblər birləşməsi. *Tədris kombinatı.*

**KOMBİNEZON** [*fr.*] Bir-birinə tikilmiş kurtka və şalvardan ibarət iş paltarı. [Qızlar] *kombinezon geymiş, saçlarını yığıb yaylıqla bağlamış, dirsəkdən yuxarı gödəkqollu köynəklərdə həvəslə işləyirdilər.* M.İbrahimov. *Geydiyi kombinezon Şəfiqənin görünüşünü dəyişmişdi.* H.Seyidbəyli.

**KOMBİNEZONLU** *sif.* Kombinezon geymiş, kombinezonu olan. *Kombinezonlu qız. – Yoldaş, bu nədir? – deyə Zahidoğlu kombinezonlu gəncdən soruşdu.* S.Rəhimov.

**KOMBİNƏ** [*lat.* combinatio-dan] Kombinasiya edilmiş, birləşdirilmiş, quraşdırılmış, uyğunlaşdırılmış. ◻ **Kombinə etmək** – birləşdirmək, uzlaşdırmaq, uyğunlaşdırmaq (müxtəlif elementləri bir arada birləşdirmək).

**KOMEDİOQRAF** [*yun.*] b a x **komediyaçı.** *Cəlil Məmmədquluzadə böyük rus komedioqrafını şüurlu olaraq özünə müəllim intixab etmişdi.* M.İbrahimov.

**KOMEDİYA** [*yun.* komodia, əsli *lat.* comoedia] 1. Gülməli, məzəli, yaxud satirik məzmunlu dram əsəri. *"Şamdan bəy" komediyasında da yazıçı bizi keçmişin iyrənc tiplərindən biri ilə tanış edir.* M.Arif. [Ü.Hacıbəyov] *məhz M.F.Axundzadə və*

*C.Məmmədquluzadənin dramaturji üslubunu izləyərək.. misli görünməmiş komediyalar yazmışdır.* Ə. Sultanlı. // Bu cür əsərin səhnə tamaşası. *Qədim vaxtlarda komediyanı yunanilər gülüş üçün çıxardardılar.* N.Nərimanov.

2. *məc.* Gülməli, əyləncəli hadisə haqqında. *Bu lap komediya oldu.*

3. *məc.* Hər hansı bir məqsədlə özünü bu və ya başqa rolda göstərmə; riyakarlıq, ikiüzlülük. ☐ **Komediya oynamaq** – özünü riyakarcasına aparmaq.

**KOMEDİYAÇI** *is.* Komediya yazan dramaturq.

**KOMENDANT** [*fr.*] 1. Qalada, yaxud istehkam halına salınmış rayonda yerləşən bütün qoşunların başçısı. *Qala komendantı.*

2. Qarnizonda nizam-intizama və hərbi xidmətin düzgün aparılmasına nəzarət edən zabit. *Şəhər komendantı. Lager komendantı. – Bakıda komendant patrulları çox olardı.* Ə.Əbülhəsən. *Alman komendantının əmrinə görə cənazələr üç gün camaatın gözü qarşısında qalmalı idi.* Ə.Sadıq.

3. Yollarda ordu hissələrinin və hərbi yüklərin hərəkətinə nəzarət edən şəxs.

4. Hər hansı bir ictimai binanın, evin müdiri. *Ümumi yataqxana komendantı.* – [Məzlum:] *Bu gündən komendant məni öz yanına aparır.* S.Vəliyev.

◊ **Komendant saatı** – hərbi və ya mühasirə vəziyyəti elan edildikdə müəyyən saatlarda xüsusi icazə olmadan küçələrə çıxmağın qadağan edilməsi.

**KOMENDANTLIQ** *is.* 1. Komendant vəzifəsi.

2. Komendantın başçılıq etdiyi idarə (b a x **komendant** 2-ci mənada), həmçinin bu idarənin yerləşdiyi bina. *Komendantlıqdan icazə almaq.*

**KOMENDATURA** [*alm.*] b a x **komendantlıq** 2-ci mənada. *Komendaturada işləmək.* – [Güləbətin] *hər gün komendaturanı ayna kimi silib təmizləyirdi, stollarımızın üstünə bəzən çiçək də tapıb qoyurdu.* M.İbrahimov.

**KOMENDÓR** [*ing.*] Topçu matros.

**KOMETA** [*yun.* kometes – saçlı ulduz] *astr.* Dumanlı işıq verən ləkə və quyruğa oxşar işıq zolağı şəklində olan göy cismi; quyruqlu ulduz. *Günəş sistemini 9 səyyarə* (*planet*)*, 1600-ə yaxın kiçik planetlər, meteorlar, kometalar və günəş özü təşkil edir.* M.Qaşqay.

**KOMİ** *is.* Rusiya Federasiyasının tərkibinə daxil olan Komi MR-in əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**KÓMİK** [*yun.*] 1. Komik rollar ifa edən artist. [Eyvaz] *kolxoz dram dərnəyinin ən yaxşı komikidir.* Ə.Vəliyev.

2. *məc.* Məzəli adam, zarafatcıl.

**KÓMİK** *sif.* [*lat.*] 1. Komediyaya xas olan, komediya ilə bağlı olan. *Komik rol. Komik süjet. – M.F.Axundzadənin komediyaları böyük ictimai məsələləri əhatə edən, komik planda ictimai xarakterlər yaradan klassik komediya əsərləri idi.* M.İbrahimov. [Ü.Hacıbəyov] *öz komediyalarında komik vəziyyətlərlə bərabər, lirik və dramatik səhnələr də yaradır.* Ə.Sultanlı.

2. Məzəli, gülməli, məzhəkəli.

**KOMİKLİK** *is.* Məzəlilik, komizm. *Məşədi İbadın monoloqları dramaturgiya tarixində öz canlı komikliyi ilə diqqətəlayiqdir.* Ə.Sultanlı.

**KOMİNTERN** [*rus.* “Коммунистический Интернационал”ın ixtisarı] *tar.* Kommunist İnternasionalı (1919-cu ildə təsis olunmuş və 1943-cü ildə buraxılmışdır), kommunist partiyalarının beynəlxalq birləşməsi (Beynəlmiləl).

**KOMİSSAR** [*fr.*] 1. Keçmiş SSRİ-də: üzərinə ictimai-siyasi, təşkilati və inzibati vəzifələr həvalə olunmuş rəhbər şəxs (1918-1946-cı illərdə). // Hərbi hissənin döyüş qabiliyyəti və siyasi vəziyyəti üçün komandirlə bərabər cavab verən siyasi rəhbəri (1918-1942-ci illərdə). ☐ **Batalyon (polk, divizion** və s.**) komissarı** – 1935-1942-ci illərdə sovet ordusunda hərbi-siyasi işçilərin fərdi adı. **Hərbi komissar** – hərbi komissarlığın başında duran şəxs, hərbi komissarlığa rəhbərlik edən, hərbi vəzifəlilərin uçotu, orduya çağırışı və s. işlərlə məşğul olan adam. *Rayon hərbi komissarı.* **Xalq komissarı** – 1918-1946-cı illərdə hökumət üzvü, xalq komissarlıqlarından birinin başında duran adam.

2. Xarici ölkələrdə: polis vəzifəsini görən məmur.

3. XVII əsrin axırında Fransa burjua inqilabı dövründə: müxtəlif tapşırıqlarla departamentlərə və qoşun hissələrinə göndərilən Konvent nümayəndəsi.

**KOMİSSARİAT** [*fr.* əsli *lat.*] b a x **komissarlıq.**

**KOMİSSARLIQ** *is.* Başında komissar duran idarə, orqan. *Nə məhəlli komitə, nə ittifaq, nə də əmək komissarlığı* [Zeynalın] *tamamilə işdən xaric edilməsinə əsas etibarı ilə etiraz edə bilməyirdilər.* S.Hüseyn. *Komissarlıqdan yazıb, baş mühəndis vəzifəsinə təyin üçün namizəd istəyirdilər.* Mir Cəlal. *Qulamın yanına onunla eyni komissarlıqda işləyən bir işçi gəlmişdi.* Ə.Əbülhəsən. ◻ **Xalq komissarlığı** *tar.* – Azərbaycanda sovet dövründə dövlət idarəsi sahələrindən birinə rəhbərlik etmiş mərkəzi orqan (1946-cı ildə nazirliyə çevrilmişdir). **Hərbi komissarlıq** – hərbi vəzifəlilərin uçotu, orduya çağırışı və çağırışa qədərki hazırlığı ilə məşğul olan yerli hərbi idarə. *Göyçəyin ərizəsi hərbi komissarlıqda idi.* Ə.Əbülhəsən. [Xasayla] *birlikdə hərbi komissarlığa beş nəfər getmişdi.* Ə.Vəliyev.

**KOMİSSİYA** [*lat.* commissio – tapşırıq] 1. Xüsusi bir məqsəd, ya tapşırığı yerinə yetirmək üçün hər hansı bir idarə, təşkilat yanında yaradılan orqan və bu orqanın heyəti. *Seçki komissiyası. Hesablayıcı komissiya. Komissiya seçmək. – Bakıda keçən il qurulan ianə komissiyası qırx beş min manatdan ancaq iki vaqon un göndərdi Zəngəzura ki, putu iki manatdan satılsın və min manat da göndərdi Qarabağa.* C.Məmmədquluzadə. *Başına dönərəm o komissiyanın ki, Hacı Əliqulu ağanın adamını məktəbə götürməsin.* Qantəmir. *..Komissiyanın üzvləri təəccüblə Aslana baxdılar.* M.Rzaquluzadə.

2. Xüsusi tədbirləri həyata keçirmək üçün hökumət tərəfindən yaradılan dövlət idarəsi orqanı. *Dövlət dil Komissiyası.*

3. Xüsusi mükafat əvəzində görülən tapşırıq. ◻ **Komissiyaya götürmək** – müəyyən mükafat qarşılığında satmaq üçün qəbul etmək. **Komissiyaya vermək** – satmaq üçün vasitəçiyə vermək.

**KOMİSYÓN** [*lat.*] b a x **komissiya.** [Məmmədova] *kəndin abadlıq komisyonunun üzvüdür.* Ə.Sadıq. *İkram atasına açıqca demişdi ki, maarif nazirliyinə ərizə yazıb komisyonu mən gətirtmişəm.* Ə.Əbülhəsən.

◊ **Komisyon mağazası** – əhalidən götürdüyü şeyləri müəyyən faiz almaq şərtilə satan mağaza.

**KOMİSYONÇU** *is.* Ticarət işlərində müəyyən faiz almaq şərtilə vasitəçilik edən şəxs.

**KOMİSYONÇULUQ** *is.* Komisyonçu sənəti, peşəsi.

**KOMİSYONER** [*fr.*] b a x **komisyonçu.**

**KOMİTƏ** [*fr.* comite, əsli *lat.* committere – tapşırmaq] 1. Hər hansı bir işə rəhbərlik edən kollegial orqan. *Partiya komitəsi. İcraiyyə komitəsi. Həmkarlar ittifaqının yerli komitəsi. – Bizim burada xəlvət komitəmiz var, hər yerdən bizə xəbər gəlir.* Ə.Haqverdiyev.

2. *tar.* Xüsusi tədbirləri həyata keçirmək üçün hökumət tərəfindən yaradılan dövlət idarəsi orqanı.

**KOMİZM** [*yun.* komikos-dan] Hər hansı bir şeydə gülməli cəhət; məzəlilik, yumor. *Sözlərində çoxlu komizm var. Rolun komizmi. Komizmə qapılmaq aktyor üçün nöqsandır.* // Yumor, gülməlilik.

**KOMLAMA** "Komlamaq"dan *f.is.*

**KOMLAMAQ** b a x **komalamaq.** *O, yerə döşənmiş böyürtkən kollarını dəhrənin burnu ilə təmizləyib komlayırdı.* S.Rəhimov.

**KOMLANMA** "Komlanmaq"dan *f.is.*

**KOMLANMAQ** b a x **komalanmaq.**

**KOMLAŞMA** "Komlaşmaq"dan *f.is.*

**KOMLAŞMAQ** b a x **komalaşmaq**. *Adamlar isə gah komlaşır, gah kənara çəkilirdilər.* Mir Cəlal.

**KOMMENTARİYA** [*lat.* commentarium] Hər hansı mətnin və ya kitabın şərhi, izahı; izahat.

**KOMMENTATOR** [*lat.*] Kommentariyə verən; şərhçi, izahçı.

**KOMMUNA** [*fr.*] 1. Əmək və mülk ümumiliyi əsasında birlikdə işləmək və yaşamaq üçün birləşmiş kollektiv. *Əmək kommunası. Xalq kommunalarında yaradılmış uşaq bağçaları və körpə evləri qadınların işdə və təhsildə geniş fəaliyyət göstərmələrinə imkan*

*verirdi.* □ **Kənd təsərrüfat kommunası** – kənd təsərrüfatı kollektivləşdirilməsinin məişət xidməti, istehlak və istehsal alətlərinin tamamilə ellikləşdirilməsinə əsaslanan forması.

2. Fransa və bəzi başqa ölkələrdə: yerli inzibati-ərazi vahidi, şəhər və ya kənd tipli məntəqə.

3. *tar.* İnqilab dövründə bəzi ölkələrdə qurulan inqilabi hökumət. □ **Bakı kommunası** *tar.* – 1918-ci ildə Bakı zəhmətkeşlərinin üsyanına rəhbərlik edən inqilabi hökumət. **Paris kommunası** – 1871-ci ildə Parisdə üsyan qaldırmış zəhmətkeş kütlələrin inqilabi hökuməti.

**KOMMUNAL** *sif.* [*fr.*] Şəhər təsərrüfatına aid olan. *Kommunal təsərrüfatı. Kommunal xidməti. Kommunal işləri üçün vəsait artırıldı.*

**KOMMUNAR** [*fr.*] *tar.* 1. 1871-ci ildə Paris kommunası iştirakçısı.

2. Kommuna (1-ci mənada) üzvü.

**KOMMUNİST** [*fr.* əsli *lat.*] *tar.* 1. Kommunist partiyasının üzvü. *Kommunistlərin yığıncağı.*

2. Kommunizm ideyalarına əsaslanan, onları ifadə edən və həyata keçirən; kommunizm tərəfdarı. *Kommunist partiyası.* □ **Kommunist İnternasionalı** – b a x **Komintern. Kommunist Gənclər İttifaqı** – b a x **komsomol.**

**KOMMUNİSTLİK** *is.* Kommunistə xas olan sifət və keyfiyyət.

**KOMMUNİZM** [*fr.* əsli *lat.* communis – ümumi] 1. İstehsal alətlərinin ümumiləşdirildiyi və xüsusi mülkiyyətin olmadığı ictimai quruluş.

2. Kommunizm cəmiyyəti qurulması haqqında siyasi, iqtisadi və ictimai təlim.

**KOMMUTASİYA** *is.* [*lat.*] Müəyyən məsələnin həlli üçün hesablayıcı maşının köklənməsi, sazlanması, qurulması.

**KOMMUTÁTOR** [*lat.* commutare – dəyişmək] 1. Elektrik cərəyanını açıb-bağlayan və ya onun istiqamətini dəyişdirən cihaz.

2. Telefon rabitəsində: telefon xətlərini birləşdirən qurğu. *Zavod kommutatoru. Kommutatorda işləmək. – Kommutatorun qabağında mürgüləyən Əsgərin qıvrım saçları üzünə tökülmüşdü.* S.Rəhimov. [Qız:] *Kommutator otağının pəncərələri bizim qurğuya açılır.* H.Seyidbəyli.

**KOMMUTATORÇU** *is.* Kommutatorda işləyən adam. *Kommutatorçu qız.*

**KOMOD** [*fr.*] Dəyişək, müxtəlif tualet şeyləri və s. qoymaq üçün siyirməli yastı şkaf növü. *Güzgü, daraq komodun sol gözündədir. – Şəhla xanım şaqşaraqla komodun siyirmələrini açdı.* S.Rəhimov. *Xanpəri komoddan bir vərəq kağız çıxartdı.* Ə.Vəliyev.

**KOMPÁNİYA** [*fr.*] b a x **şirkət.**

**KOMPARÁTİVİST** [latıncadan] *dilç.* Müqayisəli-tarixi dilçilik mütəxəssisi; dillərin tədqiqində, ədəbiyyat nəzəriyyəsində müqayisəli üsul tətbiq edən alim.

**KOMPARÁTİVİZM** [*lat.* comparativus – müqayisəli] Dilçilikdə müqayisəli-tarixi üsul.

**KÓMPAS** [*ital.*] Maqnitləşdirilmiş əqrəbi həmişə şimalı göstərməklə dünyanın cəhətlərini təyin edən cihaz; qiblənüma. *Kompasla getmək. – Kamil plaşını geyərək kompas, fotoaparat, durbin və kağızlarını götürdü, çarpayıda yatmış Yadigarı öpdü, anası ilə görüşüb küçəyə çıxdı.* M.Süleymanov.

**KOMPİLYÁSİYA** [*lat.* compilatio-dan] Müstəqil tədqiqat aparılmadan başqalarının əsərlərindən istifadə yolu ilə yazılan əsər. *Kompilyasiya etmək. Kompilyasiya ilə məşğul olmaq.*

**KOMPİLYASİYAÇI** *is.* Kompilyasiya ilə məşğul olan adam, kompilyasiya müəllifi.

**KOMPİLYATİV** [*lat.* compilatio-dan] Kompilyasiya yolu ilə qurulmuş, kompilyasiya mahiyyətində olan. *Kompilyativ əsər.*

**KÓMPLEKS** [*lat.* complexus – əlaqə] Bir vəhdət təşkil edən şeylərin və ya hadisələrin məcmusu. *Mingəçevir su qovşağı kompleksi.* □ **Kompleks briqada** – müxtəlif ixtisaslı fəhlələrdən ibarət istehsalat briqadası. *Tikintidə işləyən kompleks briqada. Kompleks briqada təşkil etmək.*

**KOMPLEKSLİ** *sif.* Kompleks şəklində olan; toplu. *Üçüncü kompleksli becərmə qurtarmaq üzrədir.* (Qəzetlərdən).

**KOMPLEKT** [*lat.* completus – tam, dolu] Tam təşkil edən şeylərin toplusu; dəst. *Qazıma komplekti.*

**KOMPLEKTLƏŞDİRİCİ** *sif.* və *is.* Komplektləşdirmə işi ilə məşğul olan işçi. *Kitabxana kollektorunun komplektləşdiricisi.*

**KOMPLEKTLƏŞDİRİLMƏ** "Komplektləşdirilmək"dən *f.is. Dövri mətbuatın komplektləşdirilməsi.*

**KOMPLEKTLƏŞDİRİLMƏK** "Komplektləşdirmək"dən *məch.*

**KOMPLEKTLƏŞDİRMƏ** "Komplektləşdirmək"dən *f.is.*

**KOMPLEKTLƏŞDİRMƏK** *f.* Bir şeyin komplektini düzəltmək, təkmilləşdirib komplektə çatdırmaq. *Jurnalları komplektləşdirmək. Kitabxananı komplektləşdirmək. Bir illik qəzeti komplektləşdirmək.* // Bir idarənin, şöbənin və s. tərkibini işçilərlə təmin etmək, onların sayını lazımi miqdara çatdırmaq, çatışmayan sayını tamlaşdırmaq. *İdarənin ştatını komplektləşdirmək. Şöbəni ixtisaslı işçilərlə komplektləşdirmək.*

**KOMPLEKTLƏŞMƏ** "Komplektləşmək"-dən *f.is.*

**KOMPLEKTLƏŞMƏK** *f.* Komplekt şəklini almaq, komplektə çatmaq; tamlaşmaq.

**KOMPLEKTLİ** *sif.* və *zərf* Komplekt halında; tam, bütün halda. *Komplektli məhsul buraxmaq.*

**KOMPLEKTSİZ** *sif.* Komplekt (tam, bütün) şəklində olmayan. *Komplektsiz və standartsız məhsul.*

**KOMPLİMÉNT** [*fr.*] Birisinə iltifat, xoş görünmək və ya yaltaqlıq təriqilə deyilən xoş söz, tərifli ifadə. *Səməd öz müdirinin səmimi komplimentlərindən yenə də çox məmnun olub bığlarını tumarladı.* B.Talıblı ...*Gövhər Mədədovun ehtiyatlı komplimentlərini birinci günlər rişxənd kimi qəbul edirdi.* Ə.Əbülhəsən. ◻ **Kompliment atmaq (demək)** – birinin xoşuna gəlmək üçün ona xoş söz söyləmək, iltifat göstərmək. *Bizim .. nə zarafat üçün, nə də kompliment demək üçün vaxtımız yoxdur.* C.Cabbarlı. *Birinə göz edirdi, birisinə gülümsünürdü və kimisinə də seçmə bir kompliment deyib nəzərini özünə cəlb edirdi.* Çəmənzəminli.

**KOMPLİMENTÇİ** *is. dan.* Kompliment deməyi sevən adam.

**KOMPONENT** [*lat.*] Bir şeyin tərkib hissəsi, bir şeyi əmələ gətirən hissələrdən hər biri. *Mürəkkəb sözün komponentləri.*

**KOMPÓST** [*ing.*] Heyvan, mineral və ya bitki tullantılarının torf, yaxud torpaqla qarışdırılmasından alınan üzvi gübrə.

**KOMPÓSTER** [*fr.*] *köhn.* Biletlərə, bank çeklərinə və s.-yə yoxlama işarəsi vuran alət.

**KOMPOSTLAŞDIRILMA** "Kompostlaşdırmaq"dan *f.is.*

**KOMPOSTLAŞDIRMA** *f.* Komposterlə işarə vurmaq. *Bileti kompostlamaq.*

**KOMPÓT** [*fr.*] Suda qəndlə bişirilmiş təzə və ya quru meyvədən ibarət duru yemək; xoşab. *Qaysı kompotu. Kompot bişirmək. Bir stəkan kompot.* – [Aslanovun] *xörəkdən sonra cürbəcür çərəz yeməklə, yaxud kompot içməklə heç arası yox idi.* M.Hüseyn.

**KOMPOZİSİYA** [*lat.*] 1. Ədəbiyyat və incəsənət əsərlərinin quruluşu və onların hissələri arasında qarşılıqlı əlaqə. *Şəklin kompozisiyası. Romanın kompozisiyası.*

2. Musiqi əsəri. // Müəyyən quruluşu, vəhdəti olan rəssamlıq əsəri haqqında.

3. Musiqi əsərlərinin yazılması nəzəriyyəsi. *Kompozisiya sinfi. Kompozisiyadan mühazirə.* // Musiqi əsərlərinin bəstələnməsi.

**KOMPRADÓR** [*isp.* comprador – alıcı] Şərqin bəzi müstəmləkə və asılı ölkələrində: xarici kapitalla yerli bazar arasında vasitəçilik edən yerli tacir, kapitalist.

**KOMPRÉS** [*fr.*] Müalicə məqsədi ilə ağrıyan yerə qoyulan yaş sarğı. [Doktor] ..*qızdırma artdığı zaman* [Arazın] *başına, ürəyinə kompres qoyurdu.* A.Şaiq.

**KOMPRÉSSOR** [*lat.*] Havanı, buxarı, qazı sıxmaq üçün maşın. *Kompressor stansiyası* (həmin maşınlar olan stansiya). – *Kompressor stansiyasından gələn yeknəsəq guppultunun arası kəsilmirdi.* M.Hüseyn.

**KOMPRESSORÇU** *is. xüs.* Kompressorda işləyən, kompressoru idarə edən. *Kompressorçu fəhlə.*

**KOMPRESSORLU** *sif. tex.* Kompressoru olan, kompressorla işləyən. *Kompressorlu neft quyusu.*

**KOMPROMAT** *is.* [*fars.*] Nüfuzdan salma, gözdən salma, adına ləkə gətirmə.

**KOMPROMİS** [*lat.* compromissum-dan] Qarşılıqlı güzəşt əsasında razılaşma, uzlaşma.

**KOMPROMİSLİ** *sif.* Kompromisə əsaslanan, kompromis yolu ilə olan; güzəştli. *Kompromisli təklif.*

**KOMPYUTER** *is.* [*ing.*] Hesablayıcı elektron maşın.

**KOMSOMOL** [*rus.* "Коммунистический союз молодёжи"nin ixtisarı] 1. *tar.* Kommunist Gənclər İttifaqı.

2. Canlı dildə "komsomolçu" mənasında.

**KOMSOMOLÇU** *is. tar.* Kommunist Gənclər İttifaqı üzvü. // Sif. mənasında. [Qəhrəman:] *Yoldaşlarımın biri nazik, arıq, alagözlü, parlaq qarasaçlı, diribaş bir komsomolçu qız idi.* H.Nəzərli.

**KOMSOMOLLUQ** *is. tar.* Kommunist Gənclər İttifaqının üzvü olma.

**KONDENSASİYA** *is.* [*lat.*] Qazvari və ya buxovvari maddələrin maye və ya bərk hala keçməsi.

**KONDENSATOR** [*lat.* condensare-dən] 1. *fiz.* Külli miqdarda elektriki toplamaq üçün cihaz. *Kondensatoru sarğılarla birləşdirən kimi sarğılardan cərəyan keçəcək və beləliklə, kondensator boşalacaqdır.* M.Süleymanov.

2. İşlənmiş buxarı soyutmaq üçün cihaz; soyuducu.

**KONDİSİONER** *is.* [*lat.*] Binalarda və ya maşınlarda sərinləşdirici qurğu.

**KONDUKTOR** [*lat.* conductor – müşayiət edən] Qatarı müşayiət edən, onun təhlükəsizliyinə və düzgün hərəkətinə, yüklərinin qorunmasına nəzarət edən dəmiryol işçisi. *Konduktor Kazımı kadr şöbəsinə çağırıb dedilər ki, – sabahdan sən qatar müfəttişi olacaqsan!* Mir Cəlal. // *köhn.* Tramvayı, avtobusu, trolleybusu müşayiət edən, onda qayda-qanuna nəzarət edən, sərnişinlərə bilet satan şəhər nəqliyyatı işçisi.

**KONDUKTORLU** *sif.* Konduktoru olan. *Konduktorlu avtobus.*

**KONDUKTORLUQ** *is.* Konduktorun işi, vəzifəsi.

**KONDUKTORSUZ** *sif.* Konduktoru olmayan. *Konduktorsuz tramvay* (*trolleybus*).

**KONFEDERASİYA** [*lat.*] 1. Müxtəlif təşkilatların birləşməsi, ittifaqı. *Latın Amerikası zəhmətkeşlərinin konfederasiyası.*

2. Ümumi bir məqsədi həyata keçirmək üçün (öz müstəqilliklərini saxlamaq şərtilə) birləşmiş dövlətlərin ittifaqı.

**KONFERANSYÉ** [*fr.*] Konsert proqramının nömrələrini elan edən və bəzən nömrələr arasında tamaşaçıları məşğul edən artist. *Lətifənin yaxşı tanıdığı konferansye cavan fəhlələrin özlərindən deyildi.* M.Hüseyn.

**KONFERANSYELİK** *is.* Konferansyenin işi, peşəsi.

**KONFESSİONAL** *is.* [*lat.*] Dini, dinə aid olan.

**KONFÉT** [*ital.* əsli *lat.*] Adətən kiçik plitə, yastı həb, kiçik şar və s. şəklində şirniyyat məmulatı; şirni. *Konfet fabriki. Konfet qutusu. – İyirmi-otuz adam qız evində yeyib-içib, hərə cib yaylığına yarım girvənkə, yaxud bir girvənkə noğul, şirni, konfet, qənd bağlayıb götürər, gedərlər.* R.Əfəndiyev. *Cəlal, ağzında konfet, gəlib durur qapıda, övrətlərə baxır.* C.Məmmədquluzadə. *Sonra Həbib qıza iki konfet verdi, qız səmimi halda məsum-məsum güldü.* Ə.Vəliyev.

**KONFETTİ** [*ital.*] Təntənəli ziyafətlərdə, maskaradlarda iştirakçıların bir-birinin başına səpdikləri əlvan kağız pilələr.

**KONFRANS** [*lat.*] Müəyyən məsələləri müzakirə və həll etmək üçün partiya, ictimai və s. təşkilat nümayəndələrinin, habelə hökumət nümayəndələrinin müşavirəsi, yığıncağı. *Elmi konfrans. Beynəlxalq konfrans. – Keçən bazar ertəsi günü firqə klubunda teatr konfransı çağırılmışdı.* C.Məmmədquluzadə. *Beş-altı ay əvvəldən başlayaraq, ara-sıra Məsməyə klub, konfrans kimi ictimai yerlərdə rast gələrdim.* S.Hüseyn. *Həsən Tiflisdə çağırılan konfransdan qayıdanda iki dolu* [zənbil] *Zaqatala tütünü gətirirmiş.* Qantəmir.

**KONKÁ** [*rus.*] *köhn.* Tramvayın tətbiqinə qədər vaqonları atla hərəkətə gətirilən şəhər dəmir yolu, habelə bu yolda işləyən vaqon. [Zərbəli:] *Usta, getdim yolda ətəklədim, bir qapaz vurdu yıxıldım, mən durunca mindi konkaya qaçdı.* Ə.Haqverdiyev. *Şəhərdə gəzməyə mindən ziyada faytonlar; Nə qədər avtomobil, çoxlu konkalar varmış.* Ə.Nəzmi. *Telefon küçəsində konka gözləyənlərin sayı hər günkündən çox idi.* M.S.Ordubadi.

**KONKAÇI** *is. köhn.* Konka sürücüsü. *Konkaçı konkanı dayandırdı, qamçını konkanın içinə atıb dedi: Gəl özün sür!* M.S.Ordubadi.

**KONKİ** [*rus.*] *idm.* Buz üstündə sürüşmək üçün ayaqqabıya taxılan dəmir xizəkciklər.

**KONKRÉT** *sif.* [*lat.* concretus – qatı, sıx] Tam, dəqiq, aydın, müəyyən, qəti, real mövcud olan (*abstrakt* əksi). *Konkret fakt. Konkret misal. Konkret məsələ. Konkret cavab vermək. Konkret iş.*

**KONKRETLƏŞDİRİLMƏ** "Konkretləşdirilmək"dən *f.is.*

**KONKRETLƏŞDİRİLMƏK** *məch.* Konkret hala salınmaq; müəyyənləşdirilmək.

**KONKRETLƏŞDİRMƏ** "Konkretləşdirmək"dən *f.is.*

**KONKRETLƏŞDİRMƏK** *f.* Bir şeyə əyani xarakter vermək, konkret hala salmaq; müəyyənləşdirmək. *Gülşən bəzi məsələləri konkretləşdirmək, aydınlaşdırmaq üçün sabah partiya komitəsi katibinin yanına getməyə hazırlaşır.* Ə.Vəliyev.

**KONKRETLƏŞMƏ** "Konkretləşmək"dən *f.is.*

**KONKRETLƏŞMƏK** *f.* Konkret hala düşmək, müəyyənləşmək, tam aydın şəkil almaq. *..Həyatda hər kəsin eşitdiyi, özünə görə təsəvvür etdiyi və bəzən sövqi-təbii ilə dərk etdiyi bir məfhum* [Veys] *üçün konkretləşdi.* Ə.Əbülhəsən.

**KONKRETLİK** *is.* Müəyyənlik, aydınlıq, qətilik. *Bəli, konkretlikdən, yəni müəyyən və nəqdi bir işdən yapışıb çalışmaq – ümumxalq işi üçün çalışmaqdır.* S.Rəhimov.

**KÓNKURS** [*lat.* concursus – toqquşma] Vəzifə tutmaq, mükafat almaq və s. üçün iştirakçılardan ən yaxşısını seçmək məqsədilə düzəldilən yarış; müsabiqə. *Konkurs imtahanı. Konkursda iştirak etmək. Konkurs sərgisi. – Uzağa niyə gedək, gəl sənə keçənilki konkursdan deyim.* S.Rüstəm.

**KONQLOMERÁT** [*lat.*] 1. Müxtəlif cinsli şeylərin və ya hissələrin mexaniki, təsadüfi birləşməsi.

2. *geol.* Başqa süxurla birləşmiş müxtəlif minerallardan ibarət süxur.

**KONQRES** [*lat.* congressus – iclas] 1. Geniş miqyaslı beynəlxalq qurultay, müşavirə, yığıncaq. *Ümumdünya analar konqresi. Həmkarlar ittifaqlarının ümumdünya konqresi.*

2. ABŞ-da və bəzi Latın Amerikası ölkələrində qanunverici orqanın (parlamentin) adı.

3. Bəzi ölkələrdə siyasi partiya və təşkilatların adı. *Hindistan milli konqresi.*

**KONQRESMÉN** [*ing.*] Konqres (2-ci mənada) üzvü.

**KONQRUYENT** *sif.* [*lat.*] *riyaz.* Bir-birinin üzərinə qoyulduqda düz gələn.

**KÓNSENTRAT** [*lat.* concentratio-dan] 1. Quru və preslənmiş halda hazırlanan hazır ərzaq məhsulu.

2. *k.t.* Yüksək keyfiyyətli qidalı maddələrdən ibarət heyvan yemi.

3. *məd.* Faydalı qazıntılardan saflaşdırma yolu ilə alınan filiz.

**KONSENTRİK** [*lat.* con – birgə və centrum – mərkəz] *riyaz.* Ümumi mərkəzli, ümumi mərkəzi olan.

**KONSENTRİKLİK** *is. riyaz.* Konsentrik fiqurun halı, ümumi mərkəzi olma.

**KONSÉPSİYA** [*lat.*] Hər hansı bir hadisə haqqında əsas fikir; görüşlər sistemi. *İnkişaf haqqında bir-birinə zidd iki konsepsiya – dialektik və metafizik konsepsiya mövcuddur.*

**KONSÉRN** [*ing.* concern] 1. Çoxlu ticarət-sənaye müəssisələrinin iri kapitalist inhisarı formalarından biri kimi vahid maliyyə rəhbərliyi altında birləşməsi.

**KONSÉRT** [*ital.*] 1. Bir sıra musiqi, balet əsərlərinin, estrada və s. nömrələrinin müəyyən proqram əsasında kütləvi surətlə ifa olunması. *Simfonik konsert. Kamera konserti. Estrada konserti. Gecə institutumuzda konsert vardı.* İ.Əfəndiyev.

2. Orkestrin müşayiəti ilə bir musiqi aləti tərəfindən ifa olunmaq üçün yazılmış iri musiqi əsəri. *Tarla orkestr üçün konsert. Skripka üçün konsert.*

**KONSERTÍNO** [*ital.*] 1. Altıbucaqlı qarmon şəklində musiqi aləti. *Konsertino çalmaq.*

2. Konsert (2-ci mənada) tipli, lakin ondan kiçik musiqi əsəri. *Konsertino bəstələmək. – Kiçik həcmli konsertlərə konsertino deyilir.* Ə.Bədəlbəyli.

**KONSERTMÉYSTER** [*alm.* konzertmeister] 1. Simfonik orkestrdə solist və ya birinci skripkaçı, arfaçı və s.

2. Oxuyacaqları şeyləri öyrənməkdə müğənniyə kömək edən müşayiətçi – pianoçu.

**KONSÉRV** [*fr.* conserves] Xüsusi işləmə (*duzlama, bişirmə, mikrobsuzlaşdırma*) yolu ilə hazırlanıb germetik (kip) bağlanmış ban-

kalara doldurulmuş yemək şeyləri. *Balıq konservi. Ət konservi.* – [Döyüşçülər] *arxa çantalarından çıxarıb konservi açır, ortalığa çörək qoyurdular.* Ə.Əbülhəsən. [Cavad] *kürkünün cibindən çıxardığı konservi bir ağsaqqal kişiyə uzadaraq gülümsündü..* Ə.Vəliyev.

**KONSERVAÇAN** *is.* Konserv qablarını açmaq üçün alət. *Bıçağın üç-dörd tiyəsi, qayçısı, dırnaqtutanı, konservaçanı, vintburanı, tıxacçıxardanı vardı.* M.Hüseyn.

**KONSERVATURİYA** [*ital.*] Ali musiqi məktəbi. *Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyası. Konservatoriyaya daxil olmaq.* – [Rəhim:] *Mən müharibədən əvvəl Bakıda Dövlət Konservatoriyasının yanında onillik musiqi məktəbində oxuyurdum.* Ə.Sadıq. *Konservatoriyanın tələbə və müəllimlərinin qüvvəsi ilə tez-tez müsamirələr verilir.*

**KONSERVÇİ** *is.* Konserv sənayesi işçisi.

**KONSERVLƏMƏ** "Konservləmək"dən *f.is.*

**KONSERVLƏMƏK** *f.* 1. Ərzağı konserv halına salmaq, konserv hazırlamaq. *Balığı konservləmək. Əti konservləmək. Badımcanı konservləmək.*

2. *xüs.* Xüsusi surətdə işləməklə və xüsusi şəraitdə saxlamaqla xarab olmaqdan, korlanmaqdan qorumaq, mühafizə etmək. *Qanı konservləmək.*

**KONSERVLƏŞDİRİCİ** *is.* və *sif.* Konserv edən, konservə çevirən.

**KONSERVLƏŞDİRİLMƏ** "Konservləşdirilmək"dən *f.is.*

**KONSERVLƏŞDİRİLMƏK** "Konservləşdirmək"dən *məch. Bir ton pomidor konservləşdirildi. – Albalını yaş halda çox saxlamaq olmaz, lakin o dondurulduqda və digər üsulla konservləşdirildikdə yaxşı qalır.*

**KONSERVLƏŞDİRİLMİŞ** *f.is.* 1. Konserv halına salınmış, konservə çevrilmiş. *Konservləşdirilmiş tərəvəz.*

2. *xüs.* Xüsusi üsullarla işlənərək saxlanmış, mühafizə olunmuş. *Konservləşdirilmiş qan.*

**KONSERVLƏŞDİRMƏ** "Konservləşdirmək"dən *f.is. Azərbaycan Qanköçürmə İnstitutunun xəstəxana və qanı konservləşdirmə şöbəsi vardır.*

**KONSERVLƏŞDİRMƏK** b a x **konservləmək.** *İnstitutun laboratoriyaları qan sistemi xəstəliklərinin öyrənilməsi, qanı konservləşdirmək .. sahəsində xeyli iş görmüşdür.*

**KONSERVLƏŞMƏ** "Konservləşmək"dən *f.is.*

**KONSERVLƏŞMƏK** *f.* Konserv halına düşmək, konservə çevrilmək.

**KONSÉSSİYA** [*lat.*] 1. Ölkə daxilində sənaye müəssisələri təşkil etmək, faydalı qazıntıları çıxarmaq və s. üçün müəyyən şərtlərlə dövlətlə ayrı-ayrı kapitalistlər və ya şirkətlər arasında bağlanan müqavilə.

2. Bu müqavilə əsasında təşkil edilmiş müəssisə.

**KONSESSİYAÇI** *is.* Konsessiya sahibi.

**KONSİLİUM** [*lat.*] Çətin hallarda xəstəliyi, onun müalicə üsullarını müəyyənləşdirmək üçün düzəldilən həkimlər müşavirəsi. *Konsilium təyin etmək. – Ertəsi gün Zəki ən məşhur həkimlərdən bir konsilium təşkil etdi.* A.Şaiq.

**KONSLAGER** [*rus.* концентрационный лагерь, əsli *lat.* concentratio və *alm.* lager] Məhbusları, hərbi əsirləri təcrid etmək üçün düşərgə; həbs düşərgəsi.

**KONSONÁNS** *is.* [*fr.*] Musiqidə səs uyğunluğu, ahəng.

**KONSONANT** *is.* [*lat.*] Samit səs.

**KONSÓRSİUM** [*lat.* consortium – iştirak] Birgə maliyyə əməliyyatı aparmaq üçün bir neçə bankın, yaxud bankirin iri inhisarçı birliyi. *Beynəlxalq neft konsorsiumunun fəaliyyəti haqqında saziş.*

**KONSÓRT** *is.* [*lat.*] Britaniyada kraliçanın əri.

**KONSPÉKT** [*lat.* conspectus – xülasə] Bir mühazirənin, məruzənin, nitqin, əsərin məzmununun qısaca xülasəsi, qeydi. *Konspekt tutmaq. Mühazirələrin konspekti. Konspektdən istifadə etmək. – Mədəd oxuduğunun konspektini çıxartdı.* Ə.Vəliyev.

**KONSPİRÁSİYA** [*lat.* conspiratio – suiqəsd] Öz fəaliyyətini və üzvlərini gizli saxlamaq üçün gizli təşkilatın işlətdiyi üsullar. *Konspirasiya işi.* // Sirr saxlama.

**KONSPİRATİV** *sif.* [*lat.* conspiratio – "suiqəsd"dən] Gizli.

**KONSPİRATİVLİK** *is.* Gizlilik.

**KONSTİTÚSİYA** [*lat.* constitutio – quruluş] Bir dövlətin ictimai və dövlət qurulu-

şunu, seçki sistemini, dövlət orqanlarının fəaliyyət və təşkilat prinsiplərini, vətəndaşların əsas hüquq və vəzifələrini müəyyən edən əsas qanunu. *Azərbaycan Konstitusiyası. Demokratik konstitusiya. Konstitusiyanın maddələri.*

**KONSTİTUSİYAÇI** *is.* və *sif.* Konstitusiya tərəfdarı (olan).

**KONSTİTUSİYALI** *sif.* Konstitusiyası olan, konstitusiyaya əsaslanan. *Konstitusiyalı dövlət quruluşu. Konstitusiyalı idarə üsulu.* ◻ **Konstitusiyalı monarxiya** – padşahın hüquqlarının konstitusiya ilə məhdudlaşdırıldığı dövlət quruluşu.

**KONSTRÚKSİYA** [*lat.*] 1. Hər hansı bir tikilinin, qurğunun, mexanizmin hissələrinin qarşılıqlı yerləşməsi, quruluşu, habelə bu cür quruluşlu tikilinin, qurğunun, mexanizmin özü. *Binanın konstruksiyası. Körpünün konstruksiyası. Köhnəlmiş konstruksiya.*

2. *tex.* Mürəkkəb qurğunun, tikilinin qabaqcadan hazırlanan və sonradan onun tərkibinə daxil edilən ayrı-ayrı hissələri. *Dəmirbeton konstruksiyalar. Ağac konstruksiyalar.*

**KONSTRUKTİVİST** [*lat.* constructio-dan] Konstruktivizm tərəfdarı.

**KONSTRUKTİVÍZM** [*lat.*] XX əsr memarlığında: konstruksiyanı binanın ifadəliliyinin başlıca amili hesab edən, binanın zahiri görkəmini onun müasir konstruksiyasında görən, bu işdə yalnız mücərrəd və həndəsi formalardan istifadə edən formalist cərəyan. *Bir cərəyan kimi konstruktivizm ədəbiyyat və musiqidə də öz əksini tapmışdır.*

**KONSTRUKTOR** [*lat.* constructio-dan] 1. Konstruksiya düzəldən mütəxəssis. *Təyyarə konstruktoru. Baş konstruktor.*

2. Uşaqların quraşdırıb müxtəlif şeylər düzəltməsi üçün içində müxtəlif hissələr, detallar olan qutu.

**KONSTRUKTORLUQ** *is.* Konstruktorun peşəsi, sənəti.

**KÓNSUL** [*lat.*] 1. Bir dövlətin başqa bir dövlətin müəyyən məntəqəsində öz dövlətinin və onun vətəndaşlarının hüquqlarını təmsil və müdafiə edən vəzifəli şəxs. *Azərbaycan konsulu. Konsul vəzifəsi. – Biz təəccüb elədik ki, bugünkü gündə konsulun qapısında artıq adam görsənmir.* C.Məmmədquluzadə. [Əliqulu:] [İran əhli] *məni tanıyıb konsula məlum edər..* S.S.Axundov.

2. *tar.* Qədim Romada respublika dövründə: seçilən yüksək vəzifəli iki şəxsin hər birinin titulu, habelə belə titulu olan adam.

3. *tar.* Fransada konsulluq dövründə: qeyri-məhdud hakimiyyət verilmiş üç şəxsin titulu, habelə bu cür titulu olan adam.

**KONSULXANA** *is.* [*lat.* consul və *fars.* xanə] Bir dövlətin, başqa bir dövlətin müəyyən məntəqəsində konsulun başçılıq etdiyi nümayəndəliyi, habelə həmin nümayəndəliyin yerləşdiyi bina. *Vladiqafqazda hətta ədiblərimiz Molla İsmayılın səsini eşidəndə siçan dəliyini satın alıb konsulxanalarda gizlənirlər.* C.Məmmədquluzadə. *Bəhram şəhərdəki İran konsulxanasında katiblik edirdi.* Çəmənzəminli. *Müsyö Qamel ingilis konsulxanasında özünə məxsus edilən otaqda istirahətə çəkildi.* Qantəmir.

**KONSÚLLUQ** *is.* 1. Konsul vəzifəsi. *Konsulluq etmək.* // b a x **konsulxana.**

2. *tar.* Qədim Romada: respublika zamanı konsulun dövləti idarə etdiyi dövr.

3. *tar.* Fransada: Napoleon Bonapartın 9 noyabr 1799-cu ildəki (18 brumer) çevrilişindən 1804-cü ildə imperiya elan edildiyi vaxta qədərki dövr.

**KONSULTASİYA** [*lat.*] 1. B a x **məsləhət.**

2. Hər hansı bir məsələyə dair mütəxəssislər müşavirəsi.

3. B a x **məsləhətxana.**

**KONTÁKT** [*lat.* contactus – toxunma] Elektrik xətlərinin (məftillərinin) bir-birinə toxunması. *Elektrik xəttində kontakt var. Kontakt lövhəsi. Kontakt aparatı.* // Elektriklə işləyən nəqliyyat vasitələrində elektrik məftillərinin bitişməsini təmin edən qurğu.

**KONTÉKST** [*lat.* contextus – möhkəm əlaqə] Mətnin (ona daxil olan ayrıca söz və ya ifadənin mənasını müəyyən etmək üçün) mənaca bitmiş hissəsi. *Dil və ifadə tərzi haqqında danışanda sözləri kontekstdən ayırıb təhlil etmək doğru deyil.* R.Rza.

**KONTÉYNER** [*ing.*] *xüs.* Qablaşdırılmış yüklərin daşınması üçün böyük yeşik. *Konteynerləri vaqondan boşaltmaq. Konteynerlə yük göndərmək. – Ustanın söhbətindən göründü ki, konteynerlər tətbiq olunan yerdə avtomaşınların da işi azalır.* Mir Cəlal.

**KONTİNÉNT** [*lat.*] *coğr.* Qitə, materik.

**KONTİNENTAL** sif. [əsli *lat.*] Kontinent (qitə) üçün səciyyəvi olan, kontinentdə (qitədə) olan. *Kontinental xüsusiyyət.* ◻ **Kontinental iqlim** *coğr.* – çox dəyişkən, yayı isti, qışı isə çox soyuq olan iqlim.

**KONTİNENTALLIQ** *is.* Kontinental xassədə olma, dəyişkənlik (iqlim haqqında). *İqlimin kontinentallığı.*

**KONTİNGENT** [*lat.*] *xüs.* 1. Hər hansı bir kollektivi (müəssisəni, idarəni, təşkilatı) təşkil edən adamlar heyəti.

2. Xarici ticarətdə: bəzi malların ixracı və idxalı üçün qoyulan norma.

**KONTİNGENTLƏŞDİRİLMƏ** "Kontingentləşdirilmək"dən *f.is.*

**KONTİNGENTLƏŞDİRİLMƏK** *məch.* Kontingenti müəyyən edilmək; heyəti, miqdarı müəyyənləşdirilmək.

**KONTİNGENTLƏŞDİRMƏ** "Kontingentləşdirmək"dən *f.is.*

**KONTİNGENTLƏŞDİRMƏK** *f.* Kontingentini müəyyən etmək; heyətini, miqdarını müəyyənləşdirmək.

**KONTOR** [*alm.* kontor, *fr.* komptoir-dən] İdarə və ya müəssisələrin inzibati təsərrüfat şöbələrinin ümumi adı. *Zavod kontoru. Kontorda işləmək.* // Belə şöbə və ya idarənin yerləşdiyi bina. *Rabitə kontoru. – Araz işdən sonra birbaş kontora gəldi.* A.Şaiq. *..Şlyapasını unutduğunu isə yalnız kontorda başa düşdü.* S.Rəhman.

**KONTORÇU** *is. köhn.* Kontor xidmətçisi, kontorda işləyən adam. // Kontor müdiri.

**KONTORKA** [*rus.*] Əsasən ayaq üstə dayanıb işləmək üçün səthi maili hündür yazı stolu.

**KONTRABÁND(A)** [*ital.*] Qadağan olunmuş, yaxud gömrük verməli olan malların gizli surətdə dövlət sərhədindən keçirilməsi; qaçaqçılıq. *Kontrabanda ilə məşğul olmaq.* // Gizli olaraq dövlət sərhədindən keçirilən qaçaq mal. // Sif. mənasında. *Biri deyirdi ki, bunlar xəlvətcə o taydan kontraband malı keçirib satırlar.* C.Məmmədquluzadə.

**KONTRABAND(A)ÇI** *is.* Kontraband(a) ilə məşğul olan; qaçaqçı. *Kontrabandçıları tapıb gətirdilər.* M.S.Ordubadi.

**KONTRABAND(A)ÇILIQ** *is.* Kontraband(a) ilə məşğul olma; qaçaqçılıq.

**KONTRABÁS** [*ital.*] Simfonik orkestrin tərkibinə daxil olan həcmcə ən böyük, səslənmə cəhətdən ən aşağı səsi olan simli musiqi aləti. *Daşıdığı adından bəlli olduğu kimi, simli orkestrin tərkibi yalnız simli musiqi alətlərindən* (*skripka, alt, violonçel və kontrabas*) *ibarətdir.* Ə.Bədəlbəyli.

**KONTRABASÇI** *is.* Kontrabas çalan musiqiçi.

**KONTR-ADMİRAL** [*fr.*] Donanmada: ilk (kiçik) admiral rütbəsi və belə rütbəsi olan şəxs.

**KONTRÁKT** [*lat.*] Müqavilə, bağlaşma.

**KONTRAKTASİYA** [*lat.*] Müqavilələr əsasında kənd təsərrüfatı məhsulları tədarükü sistemi; bağlaşma.

**KONTRÁLTO** [*ital.*] *mus.* Ən bəm qadın səsi. // Bu cür səsi olan müğənni (qadın).

**KONTRAMÁRKA** [*fr.*] Teatr, sirk və s. tamaşalara pulsuz baxmaq hüququ verən talon, pətə. // Tamaşa zalından çıxan tamaşaçıya yenidən zala qayıtmaq üçün verilən və bileti əvəz edən talon, pətə və ya başqa şərti şey.

**KONTRAPÚNKT** [*alm.*] *mus.* 1. Eyni zamanda səslənən iki və ya bir neçə müstəqil səsi, havanı, melodiyanı çoxsəsli musiqi əsərində harmonik birləşdirmə sənəti.

2. Musiqi nəzəriyyəsinin belə birləşmələri, onların xüsusiyyətlərini öyrənən sahəsi.

**KONTRİBUSİYA** [*lat.*] Müharibədən sonra qalib dövlətin məğlub dövlətdən məcburi surətdə almalı olduğu pul; təzminat. // Müharibə zamanı tutulmuş yerlərin əhalisindən düşmən tərəfindən alınan məcburi vergi və ya pul.

**KONTRÓL** [*fr.*] Nəzarət, yoxlama, təftiş.

**KONTROLLUQ** *is.* Kontrolun işi, vəzifəsi; nəzarətçilik. ◻ **Kontrolluq etmək (eləmək)** – üzərində kontrol (nəzarət) etmək.

**KONTROLSUZ** *sif.* və *zərf* Üzərində kontrol (nəzarət)) olmayan (olmadan). *Kontrolsuz işləmək.*

**KONTROLYOR** [*fr.*] 1. Bir şeyi kontrol etmək, yoxlamaq vəzifəsini daşıyan şəxs; nəzarətçi.

2. *xüs.* İstehsal prosesində bir şey üzərində kontrol aparan cihaz.

**KÓNTUR** [*fr.*] 1. Bir şeyin qrafik xətlərlə xarici təsviri; bir şeyi çevrələyən xətt; çevrə.

2. *elektr.* və *rad.* Keçiricilərin qapalı dövrəsi.

◊ **Kontur xəritə** – coğrafi adlar yazılmamış tədris xəritəsi. **Kontur xətt** – qırıq-qırıq xətt, nöqtələrdən ibarət olan xətt.

**KONTÚZİYA** [*lat.*] Mərmi partlayışı, uçqun və s. nəticəsində dəriyə zərər vermədən bədənin müxtəlif yerlərində əmələ gələn zədə, əziklik, şikəstlik.

**KONTUZİYALI** *sif.* Kontuziyası olan. *Kontuziyalı adam.*

**KONUS** [*lat.* conus, əsli *yun.* konos] 1. *riyaz.* Düzbucaqlı üçbucağın, bir kateti ətrafında fırlanması nəticəsində əmələ gələn həndəsi cisim, fiqur. *Konus çəkmək.*

2. Konusa oxşayan hər hansı bir şey. *Gün də konusa bənzəyən Sağsağan dağının ardından qalxıb meşələri, tikinti sahəsini işıqlandırırdı.* İ.Əfəndiyev.

**KONUSAOXŞAR** b a x **konusşəkilli.** *Konusaoxşar təpə.*

**KONUSAOXŞARLIQ** b a x **konusşəkillilik.**

**KONUSŞƏKİLLİ** *sif.* Konusaoxşar, konus kimi, konus şəklində olan. *Konusşəkilli dağ.*

**KONUSŞƏKİLLİLİK** *is.* Konus şəklində olma, konusa oxşama.

**KONUSVARİ** b a x **konusşəkilli.**

**KONUSVARİLİK** b a x **konusşəkillilik.**

**KONVÉNSİYA** [*lat.*] Xüsusi bir məsələyə dair beynəlxalq saziş, müqavilə. *Konvensiya bağlamaq. Dəmiryol konvensiyası.*

**KONVÉNT** [*lat.* conventus-dan] Bəzi ölkələrdə: xüsusi qanunvericilik hüququna malik olan seçkili orqanların adı; şura, məclis. □ **Milli konvent** – XVIII əsrin axırlarında Fransa burjua inqilabı dövründə milli məclis.

**KONVÉRSİYA** [*lat.* conversio-dan] Vaxtı ilə buraxılmış dövlət istiqrazı şərtlərinin dəyişilməsi (faizin azalması, ödəmə vaxtının dəyişilməsi və s).

**KONVÉRT** [*fr.*] 1. B a x **zərf** 1-ci mənada. *Tərlan konverti cibindən çıxartdı, tez açıb məktubu oxumağa başladı.* M.Hüseyn. *Həsən cavab əvəzinə cibindən bir konvert çıxararaq Dilaraya uzatdı.* M.İbrahimov.

2. Südəmər uşaqlar üçün konvert şəklində tikilmiş bələk. *Uşağı konvertə qoymaq.*

**KONVÉYER** [*ing.*] İşlənib hazırlanma prosesində olan məmulatı bir yerdən başqa yerə ötürmək, yaxud nəql etmək üçün arasıkəsilmədən hərəkət edən nəqliyyat qurğusu. *Konveyer sistemi. Konveyeri quraşdırmaq.*

◊ **Konveyer kimi** – bir-birinin ardınca, birisindən o birisinə.

**KONVEYERÇİ** *is.* Konveyerin hərəkətini idarə edən fəhlə.

**KONVEYERLƏŞDİRİLMƏ** “Konveyerləşdirilmək”dən *f.is.*

**KONVEYERLƏŞDİRİLMƏK** *məch.* Konveyerlə təchiz edilmək, konveyer sisteminə keçirilmək. *Tikiş sexi konveyerləşdirildi.*

**KONVEYERLƏŞDİRMƏ** “Konveyerləşdirmək”dən *f.is.*

**KONVEYERLƏŞDİRMƏK** *f.* Konveyerlə təchiz etmək, konveyer sisteminə keçirmək. *İstehsalı konveyerləşdirmək.*

**KONVEYERLİ** *sif.* Konveyeri olan, konveyerləşdirilmiş, konveyer tətbiq edilmiş. *Konveyerli sex.*

**KONVÓY** [*holl.*] 1. Mühafizə məqsədilə və ya qaçmağın qarşısını almaq üçün birisini müşayiət edən silahlı dəstə. *Konvoy dəstəsi.* // Həmin dəstədə xidmət edən adam. – *Yaxşı qulluq göstərən konvoy onun döşündən itələyib qoymadı.* M.Hüseyn.

2. Müharibə vaxtı nəqliyyat və ticarət gəmilərini yolda düşməndən qorumaq üçün onları müşayiət edən gəmi və ya təyyarə dəstəsi. *Konvoy gəmisi.*

**KONYAK** [Fransanın cənubundakı Konyak (Cognac) şəhərinin adından] Müxtəlif üzüm şərablarının distilləsi və uzun müddət palıd çəlləklərdə saxlanılması yolu ilə hasil edilən tünd spirtli içki. *“Göy göl” konyakı. Beşulduzlu konyak. Konyak zavodu. Konyak şüşəsi. – Meyxanada dostlar bir-birinin sağlığına hərəsi altı böyük rumka konyak vurdular və yaxşı Göyçə balığının kababını məzə etdilər.* E.Sultanov. *Konyak içilə su yerinə bəzmisəfadə; Sərməst ola, şənlik eləyə atlı, piyadə.* Ə.Qəmküsar.

**KONYUKTİV**[1] [*lat.*] *qram.* Felin şərt forması.

**KONYUKTİV**[2] [*lat.* conjunctivus – birləşdirici-dən] *anat.* Gözün, göz qapağının içəridən üstünü və göz almacığının qabaq hissəsini örtən selikli qişası.

**KONYUKTİVİT** [*lat.* conjunctivus – birləşdirici-dən] *tib.* Konyuktivin iltihabı.

**KOOPERÁSİYA** [*lat.* cooperatio – birlik] 1. Əmək təşkilinin xüsusi forması (bu təşkilat formasında çoxlu adam eyni əmək prosesində, yaxud müxtəlif, lakin bir-birilə bağlı əmək prosesində müntəzəm və birgə iştirak edir).

2. Üzvlərinin – payçıların vəsaiti hesabına təşkil edilən kollektiv istehsalat, ticarət və s. birliyi. *Sənət kooperasiyası. İstehlak-mənzil kooperasiyası.*

3. B a x **kooperativ** 2-ci mənada.

**KOOPERATİV** [latıncadan] 1. Kooperasiya təşkilatı. *Kooperativ təşkilatı.* – [Muxtar] *mərkəzi işçi kooperativində orta bir vəzifə daşıyırdı.* S.Hüseyn.

2. Kooperativ mağazası, dükanı. *Rüstəm sürətli addımlarla qayıtdı və firqə özək katibini kooperativ qarşısında tapdı.* T.Ş.Simurq. *İndicə başa düşdüm ki, inteligentlər cümə günü Əliqulu vasitəsilə kooperativ mağazasından araq almaq istəyiblərmiş.* Qantəmir. ◊ **Kənd təsərrüfat kooperativi** – b a x **kolxoz.** *..Kənddə kənd təsərrüfat kooperativində olduq.* M.İbrahimov.

**KOOPERATİVÇİ** *is.* Kooperasiya işçisi, kooperativ işçisi.

**KOOPERATİVLƏŞDİRİLMƏ** "Kooperativləşdirilmək"dən *f.is. İstehsalın kooperativləşdirilməsi.*

**KOOPERATİVLƏŞDİRİLMƏK** *məch.* Kooperativə daxil edilmək, kooperativə cəlb edilmək. // Kooperasiya əsasında birləşdirilmək.

**KOOPERATİVLƏŞDİRMƏ** "Kooperativləşdirmək"dən *f.is.*

**KOOPERATİVLƏŞDİRMƏK** *icb.* Kooperativə daxil etmək, kooperativə cəlb etmək. // Kooperasiya əsasında birləşdirmək.

**KOOPERATİVLƏŞMƏ** "Kooperativləşmək"dən *f.is.*

**KOOPERATİVLƏŞMƏK** *f.* Kooperasiya əsasında birləşmək, kooperativ təşkil etmək; kooperativə daxil olmaq.

**KOOPTASİYA** [*lat.* coptatio] Hər hansı seçkili orqanın öz heyətinə seçkisiz olaraq yeni üzv daxil etməsi.

**KOORDİNAT** [*lat.*] *xüs.* Fəzada və ya səth üzərində hər hansı bir nöqtənin vəziyyətini təyin edən ədəd. *Peykin koordinatları. Coğrafi koordinat.*

**KOPPUŞ** *sif.* Kök, toppuş. *Koppuş uşaq. Koppuş əl. Koppuş adam.*

**KOR** *sif.* 1. Görmək qabiliyyətini itirmiş, gözü görməyən. *Kor uşaq. Kor qoca. – Kor quşun yuvası öz-özünə düzələr.* (Ata. sözü). *Kor rəssam əlini oğlunun başına çəkərək gülümsədi.* İ.Əfəndiyev. □ **Kor etmək (eləmək)** – gözlərini çıxartdırmaq. [Alı kişi:] *bir paşanın sözü ilə məni kor elədin.* "Koroğlu". *Bir parasın Şah İsmayıl özü kor edibdir, bir parasın Şah Abbas özü, .. onlar məsrəfdən çıxıbdır, bir zada yaramazlar.* M.F.Axundzadə. **Kor olmaq** – görmək qabiliyyətini itirmək. *Bir azdan sonra Hacının bir gözü kor oldu.* Ə.Haqverdiyev. [Qurbanqulunun] *əvvələn, bir gözü çiçəkdən kor olmuşdu, ikinci də, burnu qəribə iri idi...* T.Ş.Simurq.

2. *is.* Kor adam. *Korlar məktəbi. Korlar üçün əlifba. – Dullara və yetimlərə və şillərə və korlara ianət və himayət göstərilsin.* M.F.Axundzadə. *Dilənçilərin duaları, korların sızıltısı .. deyirdi ki, imperatorun konsulxanası açıqdır.* M.S.Ordubadi. [Mehriban:] *..Korlar işığı, gözəlliyi necə duyurlarsa, mən də məhəbbəti eləcə hiss edirəm.* İ.Əfəndiyev. // Zəif görən, gözü pis görən.

3. *məc.* Ətrafdakı hadisələri, işləri görməyən, dərk etməyən, başa düşməyən, hiss etməyən. [Cahan:] *Bəs mənim gözlərim kordur?!* Ü.Hacıbəyov. [Əbdül:] *Mənim gözüm kor deyil.* Ə.Haqverdiyev. [Südabə:] *Gözəlliyə qarşı kordur gözlərin.* H.Cavid. // *məc.* Küt, qanmaz, anlamaz, cahil. [Elxan:] *Saxlan oyunlar oyuncağı, tapdanmış qul! Hədəfsiz kor kütlə!* C.Cabbarlı. *Savadsız, elmsiz insan kordur.* M.İbrahimov.

4. *məc.* Qatı, kəsif, bərk. *Getdikcə ətraf dərələr kor dumanla doldu.* S.Rəhimov. [Xan:] *Bu kor qaranlıqda bu azğın seli keçmək olmayacaq, gərək dan ağarmasını gözləyək.* M.Rzaquluzadə. // *məc.* Aydın olmayan, bəlli olmayan, yaxşı seçilməyən; zəif. *Kor işıq.*

5. Qoşulduğu sözlərə pislik, məşumluq məfhumu verir: *Kor tale. Kor qüvvələr. – Axı bunlar nədir ki, əlində kor fələyin; Kaş çiçəyi olaydın, eyvandakı dibçəyin.* B.Vahabzadə.

6. *məc.* Çıxış yolu olmayan, ardı kəsik olan. *Kor xətt. Kor küçə.* □ **Kor çay** *coğr.* – heç

bir hövzəyə tökülməyib yarıda quruyan çay. // Pəncərəsi olmayan, pəncərəsiz. *Evin kor divarı.*

7. Qaranlıqda, dumanlı havada yalnız cihazların köməyi ilə icra edilən. *Kor uçuş. Təyyarənin kor enişi.*

◊ **Kor bağırsaq** *anat.* – yoğun bağırsağın, soxulcanvari çıxıntısı olan hissəsi. **Kor qalmaq** – cəhalətdə qalmaq, maarif işığından məhrum olmaq, dünyadan xəbərsiz olmaq. [Rüstəm:] *Mən kor qaldım, savadsız oldum.* S.Rəhimov. **Kor qoymaq** – 1) dağıtmaq, xaraba qoymaq, heçə çıxarmaq, puç etmək. [Aslan bəy:] *Sən mənim ətək-ətək tökdüyüm pulu, çəkdiyim zəhməti kor qoydun.* A.Şaiq. [Qızıl Arslan:] *Eldənizin yurdunu kor qoydun, mənim belimi sındırdın.* M.S.Ordubadi; 2) *məc.* cəhalətdə saxlamaq, gözünü bağlı qoymaq, maarif işığından məhrum etmək. *Köhnə zamanın üzü qara olsun, yaxşıca kor qoydu babanı.* Mir Cəlal. **Kor quruş (qəpik)** – bir qəpik də olsa. [Pərzad] *həm Əlidən oldu, həm də Vəlidən: kəbindən bir kor quruş gəlmədi.* Mir Cəlal. **Kor düyün** – 1) açılması çətin olan düyün; 2) *məc.* həlli çətin olan məsələ. **Kor etmək** – heç etmək, yox etmək, puça çıxarmaq. *Sözüm bəyənilib, işim saz olub; Sən Allah, siftəmi kor eyləməynən.* Aşıq Ələsgər. **Kor ilan** *zool.* – cücülərlə bəslənən ilanabənzər sürünən heyvan. **Kor yapalaq** – 1) bayquş; 2) *məc.* məşumluq, nəhslik simvolu kimi işlənir. *Gözünün üstündə Buxara papaq; Əntərə bənzəyir o kor yapalaq.* S.Vurğun. *Bu olan iş deyil, o kor yapalaq; Məni pəncəsindən buraxmaz ki, sağ.* M.Rahim. **Kor olmaq** – gözü tutulmaq, suyu kəsilmək. *Bulağın gözü kor olubdur.* **Kor olsun!** – qarğış, nifrət məqamında işlənir. *Dam üstədir damımız; Qoşadır eyvanımız; Sən ordan bax, mən burdan; Kor olsun düşmanımız.* (Mahnı). [Pəri:] *Laçınım, kor olsun Pərin, mən sənin başına bəla gətirdim.* Ə.Məmmədxanlı. **Kor öküz kimi** – heç bir iş görməyən, fəaliyyətsiz. [Bayraməli bəy:] *..Rəsul ağa, sən heç zəhmət çəkib yerindən tərpənmə, necə ki, yatmısan elə də kor öküz kimi yat..* N.Vəzirov. **Kor siçan** *zool.* – yer altında yaşayan gəmirici; köstəbək. **Kor tutduğun(u) buraxmaz** – tərs, inadkar, yekəbaş adam haqqında. **Kor höcət** – tərs, inadcıl, höcət adam haqqında. *Heç kəsi bəyənmir, özü də ki, kor höcətin lap böyüyüdür.* M.Süleymanov. **Kor çiban** – başı olmayan, gözsüz çiban. **Kor şeytan** – guya insanlara pislik gətirən mövhumi qüvvə... *Şeytandan murad həmin kor şeytandır ki, taskülahından zınqırov asılıb.* C.Məmmədquluzadə. *Adamlar həmişə bir fəlakətə, uğursuzluğa düçar olanda kor şeytandan görərdilər.* Mir Cəlal. **Kor şeytan deyir ki..., kor şeytan nə deyir...** – b a x **dəli şeytan deyir...** ("**dəli**"də). **Yurdu kor olmaq (qalmaq)** – öləndən sonra nəsli qalmamaq, yurduna sahib duran övladı qalmamaq. [Şiraslan] *Əmiraslan babasına hiss etdirmək istəyirdi ki, onun yurdu kor deyildir.* S.Rəhimov. [Hacı:] *Mən elə-belə adam deyiləm ki, yurdum kor qalsın, sabah başımı yerə qoyandan sonra var-dövlətimin başına qarğa-quzğun yığışsın.* Mir Cəlal. **Lənət sənə, kor şeytan!** – b a x **lənət.**

**KORABUĞUM** *is. məh.* Taxılın küləşinin torpağa yaxın hissəsi. *Korabuğumu nə külək aparmaz, nə də mal yeməz.*

**KORAFƏHM** b a x **korazehin.** [Kamilov:] *Yüz dəfə şəxsən özüm başa salıram, yenə baxıram ki, korafəhmin biridir.* S.Rəhimov.

**KORAFƏHMLİK** b a x **korazehinlik.**

**KORAMAL** *is. zool.* Sürünənlər sinfinə daxil olan ilanabənzər ayaqsız kərtənkələ. [Əmiraslan:] *Nurəddin, gör nə gözəl koramal balasıdır. Tut, aparıb kirpimizə verək, yesin. Qorxma, koramalın zəhəri yoxdur, adamı vurmaz.* S.S.Axundov... *İri kəsəklər, yekə kötüklərlə birlikdə ilan və koramallar maşınların altında qalırdı.* Ə.Vəliyev.

**KORAMAZ** *is. məh.* Çiy südlə qatığın qarışığından ibarət ağartı yaxud sərinləşdirici içki. [Tapdıq] *bir qədər ağladıqdan sonra da yerə düşüb koramazı .. iki boşqaba boşaltdı..* Ə.Vəliyev.

**KORAZEHİN** *sif.* Yaddaşı zəif olan, zehinsiz, küt, qabiliyyətsiz, gec anlayan, korafəhm. [Mirzə Hüseyn:] *Çox korazehin və şıltaq bir qız idi. Əlifbanı güclə öyrənə bildi.* S.Rəhman. [Qəndab:] [Məzahir] *riyaziyyatda məndən də korazehin idi.* B.Bayramov.

**KORAZEHİNLİK** *is.* Yaddaş zəifliyi, kütlük, gec anlama; korafəhmlik.

**KORBUCAQ(LI)** *sif.* və *is.* Bucağı düz bucaqdan (90°-dən) böyük olan. *Korbucaq*(*lı*) *üçbucaq.*

**KORBUZ** *sif. dan.* Yaşından böyük görünən, iri bədənli; qüvvətli, yekəpər. *Korbuz cavan. Korbuz adam.*

**KORCA(SINA)** bax **kor-koranə.**

**KORDABALÉT** [*fr.* corps de ballet] Əsas ifaçının ətrafında dəstə ilə rəqs edən balet artistləri heyəti.

**KORDİAMİN** *is.* [*lat.*] Ürək dərmanı.

**KOREYACA** *sif.* və *zərf* Koreya dilində. *Koreyaca danışmaq. Koreyaca-rusca lüğət.*

**KOREYALI** *is.* Koreyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**KORGÖZ** *sif.* 1. Gözü görməyən, gözü kor olan; kor. *Korgöz kişi.*

2. *məc.* Qafil, qəflətdə olan, xəbərsiz. [Telli Pərşana:] *Elə* [Şirzad] *kimi igid harada var, ay korgöz xanım!* M.İbrahimov.

**KORİDÓR** [*fr.*] Mənzilin, binanın ayrı-ayrı hissələrini birləşdirən dar keçid; aralıq, dəhliz. *Qaranlıq koridor. – Rüstəm bəy yavaşca koridora çıxdı, qapını taqqıldatdı.* Çəmənzəminli. *Nəcəf geniş və işıqlı bir koridora çıxdı.* Q.İlkin. // Hər iki tərəfdən məhdud dar yer haqqında.

**KORİDORCU** *is.* Mehmanxana və s.-də mərtəbə otaqlarının baxıcısı.

**KORİFÉY** [*yun.* koryphaios – başçı] Elm, incəsənət və s. sahəsində ən görkəmli xadim. *Elmin korifeyləri.*

**KOR-KOBUD** *sif. dan.* Bir qədər, yaxud çox kobud, yaraşıqsız, qaba. [Məhbubə xanım] *baxdı ki,* [Bəlli Əhməd] *düzdü, bir az kor-kobuddu, amma elə ürəyəyatan oğlandı ki, min paşa oğluna dəyər, min də xan oğluna.* "Koroğlu".

**KOR-KORANƏ** *zərf* Düşünmədən, mülahizə etmədən, fikirləşmədən, görmədən, bilmədən. *Kor-koranə iş görmək. Kor-koranə danışmaq.* – [Əsgər bəy:] *Amma İslam kor-koranə barmaqlarını yerə sürtə-sürtə rahinicat axtarır.* Ə.Haqverdiyev. [Məmmədov Aydına:] *Əlbəttə, bu o demək deyildir ki, kor-koranə tabe olasan.* H.Seyidbəyli.

**KORLAMA** "Korlamaq"dan *f.is.*

**KORLAMAQ** *f.* 1. Xarab etmək, pis vəziyyətə salmaq, yaramaz hala salmaq; pozmaq. *Şeyi korlamaq. Maşını korlamaq. – Sındırıb korlamısan; Oyuncaqları bir-bir.* R.Rza. [Vəli:] *Bu vaxta kimi beş-altı rol oynamısan, hamısını da korlamısan.* S.Rəhman. // *məc.* Pisləşdirmək, xarablamaq, puça çıxarmaq, alt-üst eləmək. *Qız Hüseyn Kürdə yalvarıb dedi: – Sən getmə, çoban adamsan, danışığını bilməzsən, işi daha da korlarsan..* (Nağıl). [Sultan bəy:] *..Mərdimazar oğlu mərdimazar hayandan gəldi isə, bütün işi korladı.* Ü.Hacıbəyov. *..Qara kişini bu soyuq hava üşütdü, nəşəsini əməlli-başlı korladı.* Ə.Əbülhəsən.

2. *məc.* Sərfəsiz xərcləmək, sovurub dağıtmaq, puç eləmək; sovurmaq. *Pulu korlamaq. – Yaşar iki ayda iki min manatlıq malı korlamışdır.* C.Cabbarlı.

**KORLANMA** "Korlanmaq"dan *f.is.*

**KORLANMAQ** *f.* Xarab olmaq, pozulmaq, yaramaz hala gəlmək, bərbad olmaq. *İki saatdan çox idi ki, kəşfiyyat buruğunda elektrik xətti korlanmışdı.* M.Hüseyn. // Məc. mənada. *Əhvalı korlanmaq. İşləri korlanmaq.*

**KORLAŞMA** "Korlaşmaq"dan *f.is.*

**KORLAŞMAQ** *f.* (Getdikcə) görmə qabiliyyətini itirmək.

**KORLUQ**[1] *is.* 1. Kor adamın halı, gözü görməmə. [Salman:] *O mənim atamın korluğuna sataşdı.* Ə.Haqverdiyev. [Məsmə:] [Ərimgil] *gözsüzlük bədbəxtliyini, korluq fəlakətini özləri üçün bir nemət hesab edirdilər.* S.Hüseyn. [Zeynal] *korluğa qismən adət etmişdisə də, yenə çox əziyyət çəkirdi.* B.Bayramov.

2. *məc.* Ətrafında baş verən hadisələri görməyi və ona qiymət verməyi bacarmama; bəsirətsizlik, uzaqgörməzlik, qəflət. *Siyasi korluq.*

◊ **Rəng korluğu** – bax **daltonizm.**

**KORLUQ**[2] *is.* Ehtiyac, çatışmazlıq, sıxıntı, əziyyət. [Osetiya torpağının] *çaydan, sudan korluğu yoxdur.* M.İbrahimov. [Pakizə xala:] *Mən onu ayazda, soyuqda, pis gündə, korluqda böyütməkdə ikən məktəb onu qucağına aldı.* Mir Cəlal. □ **Korluq vermək** – 1) başqasını incitmək, əziyyət vermək. *Qonşuya korluq vermək;* 2) sıxıntı vermək, lazımi qaydada baxmamaq. [Gülsənəm:] *Yox, oğul, insafən biz mal-qaraya korluq vermədik.* M.Hüseyn. [Bərbərzadə:] *Mən isə, tərsinə, özümə korluq verən deyiləm.* S.Rəhman. *Uşaq*

*olma, yeməyinə korluq versən zəif düşərsən...* Mir Cəlal. **Korluq etmək** *dan.* – müəyyən müddət üçün hazırlıq görmək, azuqə toplamaq. *Taxıl korluq etmək. Ağac (odun) korluq etmək.* **Korluq çəkmək** – ehtiyacda olmaq, sıxıntı çəkmək, zillət çəkmək, ağır günlər keçirmək, əziyyət çəkmək. *Sudan korluq çəkmək. Paltardan korluq çəkmək.* – [Hacı Osman:] *Bu il qoyunlarımız korluq çəkməyəcəklər ki.* N.Vəzirov. [Hacı Əhməd Almaza:] *Biz eşitdik, azuqə sarıdan korluq çəkirsiniz.* C.Cabbarlı. [Müvəkkil Firəngizə:] *Görünür yamanca korluq çəkmisiniz.* B.Bayramov. **Korluğunu çəkmək** – birinin olmamasından mənəvi əzab hiss etmək, birinin intizarında olmaq, həsrətini çəkmək. [Qurban:] *Sabahın xeyir, a Fatmanisə, kişinin korluğunu çəkmirsən ki.* Ə.Haqverdiyev.

**KOROĞLUSAYAĞI, KOROĞLUHƏNGİ** *sif.* Xalq qəhrəmanı Koroğlunun bığı kimi uzun və yuxarı burulmuş (bığ haqqında). *Uzun koroğlusayağı bığlar ona həqiqətən tipik Bakı susatanları görkəmi verirdi.* S.Rəhman.

**KOR-PEŞMAN** *zərf* İstədiyini əldə etməmiş, arzusuna çatmamış; əliboş, peşman halda. *Kor-peşman geri dönmək. Kor-peşman yola düşmək.* – [Rəsul] *kor-peşman anasının yanına gəlib onu işdən hali etdi.* "Aşıq Qərib". *Kürdlər də kor-peşman öz qoyunlarını götürüb Arazın qırağına getdilər.* "Aşıq Ələsgər". [Əhməd] *..başına bir çəllək soyuq su tökülmüş adam kimi kor-peşman yenidən malları bir-bir xurcuna yükləyib mindi.* B.Talıblı.

**KORPORÁSİYA** [*lat.*] Bir peşəyə, silkə və s. mənsub olan adamların ittifaqı, birləşməsi, cəmiyyəti.

**KÓRPUS** [*lat.*] 1. Ümumi sahədə yerləşən binalardan hər biri, yaxud böyük binanın ayrıca hissəsi. *Binanın baş korpusu. Xəstəxananın ikinci korpusu.* – *Onlar yaşayan korpus cəmisi səkkiz palatası olan ikimərtəbəli bir bina idi.* M.İbrahimov. *Bir az kənarda qırmızı kirəmit damlı geniş ağ korpuslar görünürdü.* M.Rzaquluzadə.

2. Bir neçə diviziya və ya briqadadan ibarət iri qoşun birləşməsi. *Tank korpusu.*

3. Bir hökumət yanındakı xarici dövlətlərin nümayəndələri. *Bu ziyafətdə Təbrizdə olan bütün diplomatik korpus iştirak edəcəkdir.* M.S.Ordubadi.

4. İnqilabdan əvvəlki Rusiyada: orta hərbi məktəb adlarının tərkibində işlənilir. *Vladimir Dubrovski kadet korpusunda tərbiyə almış və məktəbdən kornet rütbəsində qvardiyaya göndərilmişdi.* Puşkindən.

5. *mətb.* On punktluq mətbəə şrifti (hürufatı).

**KORRÉKTOR** [*lat.*] Korrektura oxuyan və düzəldən mətbəə və ya nəşriyyat işçisi; müsəhhih, təshihçi.

**KORREKTORLUQ** *is.* Korrektorun işi, vəzifəsi; müsəhhihlik.

**KORREKTURA** [*lat.* correctio – düzəliş] 1. Mətbəədə yığılmış mətn (nabor) səhvlərinin düzəldilməsi, təshih edilməsi. *Korrektura işarələri.*

2. Səhvləri düzəltmək üçün yığılmış mətndən çıxardılan nüsxə. *Korrektura oxumaq. Korrekturanı yoxlamaq.*

**KORRELYAT** *is.* [*lat.*] Əlaqəli dil vahidləri.

**KORRİDA** *is.* [*isp.*] İspaniyada öküzlə döyüş tamaşası.

**KORRÓZİYA** [*lat.*] Metalların və s.-nin səthinin müxtəlif fiziki-kimyəvi və bioloji amillərin təsiri nəticəsində dağılması, habelə bu prosesin özü. *Metalların korroziyası. Korroziyaya qarşı tədbirlər. Süxurların korroziyası.*

**KORRUPSİYA** *is.* [*lat.*] İctimai, siyasi xadimlərin, vəzifəli şəxslərin rüşvət, böyük hədiyyələrlə ələ alınması.

**KORSAR** *is.* [*ital.*] Dəniz quldur.

**KORSÉT** [*fr.*] 1. Bədəni şax saxlamaq, beli sıxmaq üçün paltarın altından bağlanan enli elastik kəmər. *Korset ilə kəmərini, yan qabırğaları bir-birinə bitişəcək qədər sıxmış bir qadın da konkaya mindi.* A.Şaiq.

2. Fəqərə sütununun əyilməsi və ya hər hansı bir xəstəliyi ilə əlaqədar olaraq bədənin yuxarı hissəsinə bağlanan bərk bandaj. *Gips korset.*

**KORŞ** b a x **koruş** 2-ci mənada.

**KORŞALMA** "Korşalmaq"dan *f.is.*

**KORŞALMAQ** *f. dan.* Kütləşmək, itiliyini itirmək, küt olmaq. *Bıçaq korşalıb.* – *..Korşalan baltanı hər altmış-yetmiş metrdən bir çıxarmaq lazım gəlirdi.* M.Hüseyn. // Məc. mənada. *Molla çox arxayınlıqla şəhadət bar-*

*mağını qaldırdı: – Məgər hafizəniz korşalıbmı?* S.Rəhimov.

**KORŞALTMA** "Korşaltmaq"dan *f.is.*

**KORŞALTMAQ** *f.* Kütləşdirmək, küt etmək. // Məc. mənada.

**KORTES** *is.* [*isp.*] İspaniyada və Portuqaliyada parlament.

**KORTƏBİİ** *sif.* 1. İnsanın iradəsindən asılı olmayan, təbiət qüvvələrinin təsirindən törəyən, öz-özünə baş verən. *Kortəbii hadisələr.*

2. Qeyri-mütəşəkkil, düzgün siyasi rəhbərlik olmadan; nizamsız. *Keçmişdə fəhlələrin kortəbii çıxışları. Tətilçilərin kortəbii çıxışı.*

**KORTƏBİİLİK** *is.* 1. Öz-özünə baş vermə; qarşısı alınmazlıq.

2. Qeyri-mütəşəkkillik, nizamsızlıq, özbaşınalıq.

**KORUXMA** "Koruxmaq"dan *f.is.*

**KORUXMAQ** *f. məh.* Sağalmaq, yaxşı olmaq. *Gəl, iki gözümün ağı-qarası; Koruxsun qəlbimin bəlkə yarası.* S.Rüstəm.

**KORUN-KORUN** *zərf* İçəridən közərməklə, alovsuz, közərə-közərə. *Tüstüləndi evin ortasında korun-korun yanan gərmə ocağı.* O.Sarıvəlli. *Bayaqdan bəri korun-korun tüstülənən ocaq qəfildən parıldayıb alışdı.* İ.Hüseynov.

**KORUŞ** *sif.* və *is. dan.* 1. Gözü yaxşı görməyən, gözü zəif görən. *Koruş kişi. Koruş qız.*

2. *məh.* Küt. *Koruş bıçaq. Koruş balta.*

**KORUŞLUQ** *is.* 1. Gözü yaxşı görməmə, gözü zəif görmə.

2. *məh.* Kütlük. *Bıçağın koruşluğu.*

**KOS** b a x **top.** *Hər iki dəstə əldən-ələ keçən kosu həvəslə atıb tutur, cır səslə çığırıb bağırırdılar.* M.Hüseyn. *Onlardan bir dəstə kos qovalayır, bəziləri oynaşıb gülüşürlər.* S.Rəhimov.

**KOSA** *sif.* 1. Üzündə tük bitməyən, yaxud seyrək tük bitən. *Hacı Qəvamın sağ tərəfini uzunboylu, arıq və kosa Kərbəlayı Fəraməz tutmuşdu.* T.Ş.Simurq. [Gülzar:] *Kosa Rəhim qoşulub o uzunqılça Mansura, Mansur da ona.* İ.Hüseynov. // İs. mənasında. *Kosaya hərə bir tük versə, kosa da saqqallı olar.* (Ata. sözü). [Şirinnaz:] *Necə deyərlər, kosa getdi saqqal gətirə, bığını da qoyub qayıtdı.* S.Hüseyn.

2. B a x **kos-kosa** 2-ci mənada.

**KOSAGƏLİN** *is. etnoqr.* Əsasən kosa (2-ci mənada) və gəlinin iştirak etdiyi xalq kukla (müqəvva) teatrı. *Genə bu ayın müddətində bəzi yerlərdə kosagəlin oynayacaq, uşaqlar evləri gəzib qovurğa və qovut yığacaqlar.* C.Məmmədquluzadə.

**KOSALAŞMA** "Kosalaşmaq"dan *f.is.*

**KOSALAŞMAQ** *f.* Üzünün tükləri tökülmək, yaxud seyrəkləşmək, kosa olmaq. // *məc.* Seyrəkləşmək.

**KOSALDIQAÇ** *is.* İki dəstə uşağın kosla (topla) oynadığı oyun. *Kosaldıqaç oynamaq. – Belə maraqlı oyunlardan biri də xalq arasında kosaldıqaç* (*kos aldı qaç*) *adı ilə məşhur olan oyundur.* H.Sarabski.

**KOSALIQ** *is.* Kosa adamın halı, üzün tüksüzlüyü, üzündə tük olmama və ya çox seyrək olma.

**KOSASAQQAL** *sif.* və *is.* Üzündə seyrək tük olan və ya heç olmayan. *Kosasaqqal kişi.*

**KOSASAQQALLIQ** *is.* Kosasaqqal adamın halı.

**KOSÉKANS** [*lat.* co və secans] Triqonometriyada: əlavə bucağın sekansı.

**KÓSİNUS** [*lat.* co və sinus] Triqonometriyada: əlavə bucağın sinusu.

**KOS-KOS** *is.* Uşaqların kos (top) ilə oynadıqları oyun; top-top. [Sabir] *uşaqlarla kos-kos oynamağa başladı.* S.Rəhimov. [Zərifə:] *Nəcəf.. kos-kos oynayır, bir bax!* S.Vəliyev.

**KOS-KOSA** *is. etnoqr.* 1. Novruz bayramı ərəfəsində və bayramda xüsusi geyindirilib-kecindirilmiş adamın qapı-qapı gəzib mahnı oxuyaraq pay yığmasından ibarət xalq oyunu.

2. Həmin oyunda iştirak edən əsas surət; kosa.

**KOSMETİK** *sif.* [*yun.*] Kosmetikaya aid olan, kosmetika üçün yarayan. *Kosmetik maddələr.*

**KOSMÉTİKA** [*yun.*] 1. Gigiyena və ya üzə və bədənə gözəllik və təravət vermək üçün tətbiq edilən tədbir və vasitələrin məcmusu. *Müalicə kosmetikası.* // Üzə və bədənə gözəllik və təravət vermək üçün işlədilən müxtəlif maddələr (kremlər, yağlar və s.).

2. Üzə və bədənə gözəllik və təravət vermək üçün lazım olan vəsait və maddələri hazırlama və tətbiqetmə sənəti. *Kosmetika kabineti.*

**KOSMİK** [*yun.*] Kosmosa, fəzaya aid olan, kosmosda olan, kainatla bağlı olan. *Kosmik uçuşlar. Kosmik fəza. İlk planetlərarası stansiyanın uçuşu uzaq kosmik rabitə mərkəzindən idarə olunur.* ◻ **Kosmik gəmi** – kosmosu tədqiq etmək üçün kosmosa buraxılan xüsusi cihaz və qurğularla təchiz olunmuş gəmi növü. **Kosmik toz** – ulduzlararası fəzada dumanlıqlar əmələ gətirən ən xırda zərrəciklər. **Kosmik şüalar** – fəzadan atmosferin yuxarı qatlarına düşən şüalar. **Kosmik cisimlər** – meteoritlər və ya onların qəlpələri.

**KOSMODRÓM** [*yun.* kosmos – kainat və dromos – qaçış meydançası] Kosmik gəmiləri və süni peykləri havaya buraxmaq üçün meydança (yer) və onların uçuşunu təmin etmək üçün müvafiq qurğular.

**KOSMOQONİK** [*yun.*] Kosmoqoniyaya aid olan, kainatın əmələ gəlməsinə aid olan. *Kosmoqonik nəzəriyyə.*

**KOSMOQÓNİYA** [*yun.*] Göy cisimlərinin, xüsusilə Günəş sisteminin əmələ gəlməsi və inkişafı haqqında elm.

**KOSMOLÓGİYA** [*yun.* kosmos – kainat və logos – nəzəriyyə] Bir küll kimi götürülən kainat haqqında nəzəriyyə. // Astronomiyanın bu nəzəriyyəyə həsr olunmuş şöbəsi.

**KOSMOLOJİ** [*yun.*] Kosmologiyaya aid olan.

**KOSMONÁVT** [*yun.* kosmos – kainat və nautes – üzən] Kosmik fəzaya uçan adam.

**KOSMONÁVTİKA** [*yun.* kosmos – kainat və nautike – gəmi sürmə] İnsanın kosmosa uçuşu, habelə avtomatik stansiyaların kosmosa göndərilməsinin nəzəriyyə və praktikası.

**KOSMOPOLİT** [*yun.* kosmopolites – dünya vətəndaşı] Özünü heç bir millətə mənsub etməyən, kosmopolitizm tərəfdarı olan adam. // Kosmopolitizmə aid olan, kosmopolitizmlə əlaqədar olan. *Kosmopolit ideya.*

**KOSMOPOLİTİK** [*yun.* kosmopolites-dən] Kosmopolitizmə aid olan, kosmopolitizmlə əlaqədar olan.

**KOSMOPOLİTİZM** [*yun.* kosmopolitesdən] Milli xüsusiyyətləri və ənənələri, vətəni qoruma və milli müstəqillik ideyasını inkar edən, özünü heç bir millətə mənsub etməyən, vətənə, milli mədəniyyətə xor baxan, bütün dünyanı özünə vətən hesab edən mürtəce burjua məfkurəsi.

**KÓSMOS** [*yun.*] Aləm, bütün kainat. *Kosmosun fəthi. Kosmosa uçuş.*

**KOS-NAĞARA** *is.* Ağacla çalınan iri nağara. *Döyüləndə kos-nağara; Xışma gəlib oldu dəli.* Aşıq Ələsgər.

**KOSTYUM** [*fr.*] 1. Pencək, şalvar, bəzən də jiletdən ibarət üst kişi geyimi. *Kostyum tikdirmək. Boz kostyum. – Qulluqçu Firidunun təzə kostyumunu səliqə ilə qatladı.* Mir Cəlal. *Onun əynində tünd-qəhvəyi zolaqlı bir kostyum vardı.* M.Rzaquluzadə. // Jaket və tumandan ibarət qadın paltarı.

2. Teatr və ya maskarad paltarı. [Hüseyn] *ancaq o qədər* [Kəblə Cahangirin] *haqqında düşünmüşdü ki, ayrı kostyumda və ayrı vəziyyətdə göründüyünə baxmayaraq, o saat tanıdı.* S.Rəhman.

**KOSTYUMÇU** *is.* Teatrda kostyumlara baxan işçi. // Tamaşalar üçün kostyum hazırlayan teatr işçisi.

**KOSTYUMLUQ** *sif.* 1. Kostyum tikilməyə yarar. *Kostyumluq parça.*

2. Kostyum tikiləcək parçanın miqdarı (adətən saylarla). *Burada iki kostyumluq parça var.*

**KOŞƏK** *is. məh.* Almanın, armudun, heyvanın və s. meyvələrin yeyilməyib atılan hissəsi; cecə, puçal. *Heyva koşəyi.*

**KOTAN** *is.* Yer şumlamaq üçün enli metal gavahını olan kənd təsərrüfatı aləti. *Kotanla şumlamaq. Kotan sürmək. Traktor kotanı. – Atlar, öküzlər kotana güc verir; Gah yüyürür, gah yıxılır, gah durur.* M.Ə.Sabir. *Kotan qoşub gedər çölə əkinçi; Əlində dəryaz ot biçir biçinçi.* A.Səhhət.

**KOTANCIQ** *is.* Kotanın qabağında torpağı kəsib çevirməyə kömək edən hissəcik.

**KOTANCIQLI** *sif.* Kotancığı olan. *Dondurma şumu əlverişli vaxtda kotancıqlı kotanla keçirildikdə torpağın üst qatı alta çevrilir.*

**KOTANÇI** *is.* 1. Kotan sürən, kotanla yer şumlayan əkinçi. *Kotançıların holavarları, .. cavanların gülüşməsi Budağı valeh etmişdi.* Ə.Vəliyev. // Traktora qoşulan kotana xidmət edən kolxozçu və ya sovxoz fəhləsi. *Maşın kotançıların tuşuna çatanda əyləndi.* B.Bayramov.

2. Əkinçi, rəncbər mənasında. [Heydər bəy:] *Ərz elədim ki, naçalnik, heç vaxt Cavanşirdən kotançı və kümçü görünməyib!* M.F.Axundzadə.

**KOTANÇILIQ** *is.* Kotançının işi, peşəsi; əkinçilik, rəncbərlik.

**KOTANGENS** [*lat.* co və tangens] Triqonometriyada: əlavə bucağın tangensi.

**KOTANLAMA** "Kotanlamaq"dan *f.is.*

**KOTANLAMAQ** *f.* Kotanla yer şumlamaq, yer sürmək. *Sahəni kotanlamaq.*

**KOTANLANMA** "Kotanlanmaq"dan *f.is.*

**KOTANLANMAQ** *məch.* Kotanla şumlanmaq, sürülmək. *Tarla kotanlandı.*

**KOTANLATMA** "Kotanlatmaq"dan *f.is.*

**KOTANLATMAQ** *icb.* Kotanla yeri şumlatmaq, sürdürmək. *Əkin yerini kotanlatmaq.*

**KOTLÉT** [*fr.*] Döyülmüş və ya əzilmiş ətdən (bəzən balıqdan) girdə, ya uzunsov yastı şəkildə hazırlanan yemək. *Ət kotleti. Balıq kotleti. Toyuq kotleti. Kotlet bişirmək.* – [Mirzə Mahmud:] *Mənim üçün, deginən, kotlet versinlər.* Ə.Haqverdiyev. *Kotlet hazırlamaqda olan Kəramət .. əlini işdən çəkdi.* Ə.Əbülhəsən. // Tərəvəz və s.-dən bu şəkildə hazırlanan yemək. *Kartof kotleti. Düyü kotleti.*

**KOTLETLİK** *sif.* Kotlet üçün yarayan, kotlet bişirmək üçün. *Kotletlik ət.*

**KOTMUL** *sif. məh.* Çox işlənməkdən yeyilmiş (süpürgə haqqında). *Kotmul süpürgə.*

**KOTMULLANMA** "Kotmullanmaq"dan *f.is.*

**KOTMULLANMAQ** *f.* Kotmul olmaq. *Süpürgə kotmullanıb.*

**KOTTÉC** [*ing.*] Şəhər kənarında, fəhlə qəsəbəsində və s.-də birailəlik kiçik ev. *Kottecdə yaşamaq.* – *Uzaqdan sıralanmış qutulara oxşayan, yaxınlaşdıqca böyüyən kotteclər lap sahildə idi.* Mir Cəlal.

**KOTTON** *is.* [*fr.*] Trikotaj və corab toxuyan maşın.

**KOTUL** *sif.* 1. Kobud, nəzakətsiz.

2. Kök, dolu.

**KOV** *is. dan.* Hesab, şərt. □ **Kov deyil** – hesab deyil, hesabdan deyil, sayılmır.

**KOVERKOT** [*ing.* covertcoat] 1. Üst paltarlıq bahalı yun parça növü. *5 metr koverkot. Koverkotdan kostyum tikdirmək.*

2. Bu parçadan tikilmiş. [Tələbəm] *üçüncü gün koverkot kostyumla sarı tufli geymişdi.* Qantəmir. *İndi onun əynində bahalı kostyum, boğazında ipək qalstuk, ayağında sarı tufli, başında koverkot kepka vardır.* Ə.Vəliyev.

**KOVXA** b a x **kətxuda.** *Kovxanı gör, kəndi çap.* (Ata. sözü). [Divanbəyi:] *Ey kovxa, sən o şəyatin yığıncağına rast gələn uşaqları tanıyırsanmı?* M.F.Axundzadə. *Müxtəsərin deyir Aşıq Ələsgər; Kovxanın, kattanın zatı çıxıbdı.* Aşıq Ələsgər.

**KOVXALIQ** *is. tar.* 1. B a x **kətxudalıq.**

2. Bir kovxaya tabe olan ərazi, yer. *Kəlbalı on beş ildən artıq idi ki, dönmədən bir dabana bu kovxalıqda yasavulluq edirdi.* S.Rəhimov.

3. *məc.* Böyüklük, ağalıq. *Özgə evində kovxalıq etmə!* (Ata. sözü).

**KOVKƏB** *is.* [*ər.*] *klas.* Ulduz. *Bixab qaldı kovkəbə nisbət bu gözlərim; Hər gecə özgə gözlərə uyxu gələr-gedər.* Xətayi.

**KOVROLİT** *is.* [*rus.*] Sintetik xalça (döşəmə üçün).

**KÖBƏ** *is.* 1. Paltarın yaxasına, qoluna, ətəyinə və s.-yə başqa parçadan tikilən ensiz haşiyə və s. *Birisi soruşurdu: – Çəhrayı paltara yaşıl köbə qoysan necə olar?* Ə.Vəliyev.

2. *dan.* Ümumiyyətlə, bir şeyin ətrafına çəkilən haşiyə; fırça ilə qabların kənarlarına çəkilən nazik zolaq və ya mil.

3. *bot.* Yarpaqların saplağının budaqdan ayrılan yerində, budağa bitişik olan balaca, incə pərdə.

**KÖBƏCİ** *is.* Köbə tikməklə məşğul olan adam, köbə tikən tikişçi.

**KÖBƏLƏMƏ** "Köbələmək"dən *f.is.*

**KÖBƏLƏMƏK** *f.* 1. Köbə tikmək, köbə vermək.

2. Haşiyə vermək, haşiyəyə almaq; haşiyələmək.

**KÖBƏLƏNMƏ** "Köbələnmək"dən *f.is.*

**KÖBƏLƏNMƏK** *məch.* 1. Köbə tikilmək, köbə verilmək, köbə qoyulmaq. *Paltarın yaxası köbələnib.*

2. Köbəyə alınmaq, haşiyə verilmək; haşiyələnmək. *Hərflərin kənarı qalın dodaq kimi köbələnmişdi.* B.Bayramov.

**KÖBƏLƏTMƏ** "Köbələtmək"dən *f.is.*

**KÖBƏLƏTMƏK** *icb.* 1. Köbə verdirmək, köbə qoydurmaq, köbə tikdirmək.

2. Köbə verdirmək, ətrafına köbə çəkdirmək; haşiyələndirmək.

**KÖBƏLİ** *sif.* Köbəsi olan, köbə tikilmiş, köbə verilmiş. *Köbəli paltar. Köbəli ayaqqabı.*

**KÖBƏLİK** *sif.* Köbə üçün kəsilmiş, köbə üçün yararlı. *Köbəlik lent* (*qaytan*). *Köbəlik parça.*

**KÖBƏR** *is.* Dik yer, dikdir, dik torpaq qalağı, hündür yer. *Top sındırmış bir ağac; Yaralı durna kimi; Dayanmışdır köbərdə.* R.Rza. [İlyas:] *Mən dəyirman yanındakı köbər üstündə oturub başımı aşağı salmışdım.* Ə.Məmmədxanlı.

**KÖÇ** *is.* 1. Bir yerdən başqa yerə köçən adam qrupu, qafilə. *Köç mənzil eləyib, heyvanları düzə buraxmışdı.* Ə.Haqverdiyev. *Ordu çapıb getmiş axar su kimi; Köçdən ayrı düşən bir quzu kimi.* M.Rahim. ◻ **Köç yolu** – köçərilərin, yaxud çöl heyvanlarının, sürülərin saldığı, keçdiyi yol. *Köç yolu ilə getmək. Köç yoluna çıxmaq. – Nə zaman ki, arabalar köç yoluna düzülür; Kəndli yoldaş əkinindən, biçinindən üzülür.* S.Vurğun. [Vəlinin] *səsi titrədi, gözləri önündən köç yolları, qalın meşələr, sıldırım qayalıqlar bir-bir gəlib keçdi.* M.Hüseyn. *Vağzal səkisinin enli daş pilləkənlərindən enib uzaqlaşanda, köç yolunun başına çıxanda Salamın ürəyi döyündü.* Mir Cəlal. // Köçmə işi.

2. Bir yerdən başqa yerə köçən adamların qablaşdırılmış, bir yerə yığılmış ev şeyləri, müxəlləfatı. *Köçü maşına yükləmək. Köçü daşımaq. – Səhərdən yüklənir nazlımın köçü; Cənnətülməvadır qoynunun içi.* Qurbani. ◻ **Köç etmək (eləmək)** – b a x **köçmək** 1-ci mənada. *Ellər köç eyləmiş, sürülər gəlmiş; Qoynunda bir quzu səsi yüksəlmiş...* M.Müşfiq. *Köç edib yaylağa ellər, obalar; Bulaqlar başına min bir can gələr.* Aşıq Şəmşir. **Köç üstə (üstündə)** – köçmək üzrə, köç vaxtı, köçmək ərəfəsində. *..Uşaqlıqdan bizim evdə tərbiyə almış bir kürd köç üstə qəflətən naxoşlayıb öldü.* S.S.Axundov. *Sanki köç üstündə olan bir oba pərakəndə halda yurd tutub əylənmişdi.* B.Bayramov. **Köç iti (kimi)** – 1) köçü qorumaq üçün saxlanan it; 2) *məc.* birisindən daim aralanmayan, əl çəkməyən adam haqqında. [İldırım:] *Köç iti kimi düşəcəyəm dalınıza, ha vurun ki, qayıdacağam..* N.Vəzirov. // Köçlərin müvəqqəti dayandığı yer, köçəri alaçıqları, köçəri obası. *Köçə yaxınlaşmaq. – Təpənin başında isə təkəmseyrək qaraçı köçü və ya çoban düşərgələri görünürdü.* Mir Cəlal. ◻ **Köç düşmək** – köçərilərin köçü dayanmaq, bir yerdə müvəqqəti yurd salmaq.

3. *məc.* Ölüm mənasında. *Şəmşir, nə yaşasan, axırı köçdür; Belə bir xəyala dalmışam, dağlar!* Aşıq Şəmşir.

**KÖÇ-DÜŞ** b a x **köçəköç.** [Taybuynuz öküzün] *işi ələlxüsus çətinə düşür köç-düş zamanı. Məlumdur ki, bir az hava qızdı, tərəkəmə əhli aranda dayana bilməz.* F.Köçərli.

**KÖÇƏBƏ** *sif.* Bir yerdə məskən salmayıb, daim yurdunu dəyişən; köçəri, bədəvi. *Köçəbə adam. – Amma köçəbə tayfalar arasında... qudalıq əvəzinə nişanbazlıq adəti vardır.* R.Əfəndiyev. // İs. mənasında. [Ahuramazda:] *Divlərə xidmət edən köçəbələrdir, özləri əkməz, başqalarının da əkinini tapdalar.* Çəmənzəminli.

**KÖÇƏKÖÇ** *is.* Elliklə köçmə, köçmə işi. *Köçəköç başlandı. Köçəköç vaxtı idi.*

**KÖÇƏL** *is. məh.* 1. B a x **közəl.** *Xırmanın qabağında Kərbalının kürən atı bağlanmış, qabağına Maronun verdiyi dənli köçəl tökülmüşdü.* S.Rəhimov.

2. Qarğıdalının dənələri çıxarıldıqdan sonra qalan hissəsi.

**KÖÇƏRGİ** *məh.* b a x **köçəri.**

**KÖÇƏRİ** *sif.* 1. Oturaq həyat keçirməyən, ev-eşiyi ilə daim bir yerdən başqa yerə köçən (*oturaq* ziddi). *Köçəri tayfalar. Köçəri xalqlar. // is. mənasında.* Bu cür həyat sürən adam. *Cikkildəyir quşlar yuvalarında; Köçərilər durmuş obalarında.* A.Səhhət. [Allahqulu:] *Bir dəstə köçəri qabağımızı kəsdi, atışma düşdü.* Çəmənzəminli.

2. Köçərilərlə, onların həyatı ilə əlaqədar olan. *Bu bina köçəri yatağını xatırladırdı.* M.İbrahimov.

3. Qışda isti cənub ölkələrinə uçub gələn (quşlar haqqında). *Çox köçəri quş var ki, qış mövsümü Qarabağda qalıb, isti yerlərə köçməyir.* S.S.Axundov. *..Bu göyərçinlər başqa*

*köçəri quşlar kimi gəldi-gedər deyil.* M.Rzaquluzadə. // İqlim, yem və b. şəraitlə əlaqədar olaraq yerini dəyişən (mal-qara, balıq və s. haqqında). *İncənin hər tərəfi otlaqdır. Buranın mal-qarası.. köçəri deyil, oturaqdır.* S.Rəhman. *Ömürlərinin bir hissəsini dənizdə, bir hissəsini isə çaylarda keçirən balıqlar da çoxdur. Bu, köçəri balıqlardır.* "Sualtı aləm".

4. *məc.* Bir yerdə qərar tutmayan, tez-tez yerini dəyişən. *Köçəri həyat keçirmək. – Köçəri quş kimi hər yerə qoşar; Harda axşamlasa, orda da yatar.* S.Vurğun.

**KÖÇƏRİLİK** *is.* Köçəri həyat sürmə, köçəri həyat tərzi (*oturaqlıq* ziddi). *Köçəriliyi tərk etmək.*

**KÖÇHAKÖÇ** bax **köçəköç.** [Şofer:] *Bir gün payızın əvvəlləri, bağlardan köçhaköç vaxtı idi.* M.Rzaquluzadə.

**KÖÇ-KÜLFƏT** *top.* Ailə üzvləri, ata-ana, uşaqlar hamı birlikdə. *Köç-külfəti yola salmaq. – Hacı düşməninin evinə çatır: Gəzir, görür köç-külfət bütün yatır.* A.Səhhət. *Köç-külfətlə bərabər; Ferma çıxdı dağlara.* B.Vahabzadə.

**KÖÇ(LÜ)-KÜLFƏTLİ** *zərf* Ailə üzvlərinin hamısı birlikdə, bir yerdə. *Köçlü-külfətli yola düşmək. – Mayın axırında köçlü-külfətli Kislovodskiyə gedəndə, növbədənxaric* [Hacı Əliqulu] *bizə yeddi bilet düzəltdi.* Qantəmir. *Murad kişi isə, demək olar ki, köçlü-külfətli yığışıb gündüzləri zəmidə, gecələri xırmanda keçirərdi.* Ə.Əbülhəsən. [Hacı Həsən:] *..Köçlü-külfətli sərhədi aşıb getmək olmaz?* Mir Cəlal.

**KÖÇMƏ** "Köçmək"dən *f.is. İranla xanlıq arasında etibar üçün Kiçikbəyimin Tehrana gəlin köçməsi vacib idi.* Çəmənzəminli.

**KÖÇMƏK** *f.* 1. Yaşayış yerini dəyişmək, bir yerdən çıxıb başqa yerə gəlmək, daşınmaq. *Təzə mənzilə köçmək. Şəhərdən kəndə köçmək. – Kazım dayı, Telligili köçdülər; Deyə, bir səs onu həmən ayıltdı..* M.Müşfiq.

2. İqlim, yem və b. şəraitlə əlaqədar olaraq yerini dəyişmək, bir yerdən başqa yerə (uçub) getmək. *Balıqlar çaydan gölə köçdü. Quşlar isti ölkələrə köçdü. – Cəfayi-xari görüb köçdü bağdan bülbül.* Füzuli. *Yenə qatar-qatar hara köçürsüz?* M.Rahim.

3. *məc.* Ərə getmək, gəlin getmək. *Şah qızı əmirə köçəndə özü ilə qarabaş paltarında beş cəllad aparmışdı.* (Nağıl). [Vəzir:] [Xan] *bu saatda Nisə xanımdan ötrü biixtiyardır və mənə buyurdu ki, bir həftəyədək onun köçmək tədarükünü gör!* M.F.Axundzadə.

4. *məc.* Ölmək, dünyadan getmək. *Köçdü, heyf oldu, gözəl. Vaqif dəxi düşməz ələ: Bir siyah kirpik ucundan bağrımı dələ-dələ..* M.P.Vaqif. *Vədə yaxınlaşıb, köçmək çağıdır; Bir özgə diyara bu gündən belə.* Q.Zakir. *Yarat, sən köçəndə ellər söyləsin: Dünyadan nə gözəl bir insan gedir.* M.Rahim.

◊ **Dünyadan köçmək, o dünyaya köçmək** – bax **dünya.**

**KÖÇÜRDÜLMƏ** "Köçürdülmək"dən *f.is.*

**KÖÇÜRDÜLMƏK** "Köçürmək"dən *məch.*

**KÖÇÜRMƏ** "Köçürmək"dən *f.is.*

**KÖÇÜRMƏK** *f.* 1. Birinin yaşayış yerini dəyişdirmək, bir yerdən başqa yerə daşındırmaq. *Ailəni yaylağa köçürmək. Bağa köçürmək. – Alyoşa isə, öz düşərgəsini həmin dəyədən çıxarıb, daha dərinlərə .. köçürmüşdü.* S.Rəhimov. [Ümid:] *Usta, Fərrux işini buraxıb ailəsini rayona köçürərmi?* B.Bayramov. // Bir yerdən başqa yerə gətirmək, olduğu yeri dəyişmək, yerini dəyişmək, (heyvanlar, quşlar, bitkilər haqqında). – *Meşəçi seleksiyaçılar Miçurinin seleksiya üsullarından istifadə edərək cənubda yetişən qoz, fındıq, püstə, şabalıd, badam və başqa meyvə bitkilərini şimaldakı rayonlara köçürə bilmişlər.* (Qəzetlərdən).

2. *məc.* Ərə vermək. [Fəramərz kişi:] *Qızı köçürəndən bəri işimiz yaxşı getməyir, əlimiz çatmayır.* T.Ş.Simurq. [Yaqut:] *Özün bilirsən ki, mən özgəsinin adaxlısıyam, bu yaxında məni köçürəcəklər.* Ə.Məmmədxanlı.

3. Surətini çıxarmaq, üzünü çıxarmaq, olduğu kimi mətni başqa yerə yazmaq. *Yazını köçürmək.* – [Qəndab:] [Məzahir] *riyaziyyat dəftərimi .. xəlvətcə götürüb köçürür, sonra da üzümü bir yana çevirəndə mənim skamyama atırdı.* B.Bayramov. // Ümumiyyətlə, yazmaq. *Dəmirov çalışıb qeydlər götürdüyü, öz fikirlərini ağ kağızlara köçürdüyü zaman Qiyasəddinov içəriyə girdi.* S.Rəhimov.

4. Bax **keçirmək**[1] 6-cı mənada. *Pul köçürmək.*

**KÖÇÜRTMƏ** "Köçürtmək"dən *f.is.*

**KÖÇÜRTMƏK** bax **köçürmək** [Qız:] *Ona görə ki, sən zorla şeirlərini öz xəttinlə dəftərimə köçürtdün, nəticəsi də belə oldu.* S.Rüstəm.

**KÖÇÜRÜLMƏ** "Köçürülmək"dən *f.is.*

**KÖÇÜRÜLMƏK** 1. "Köçürmək"dən *məch. Ailə bağa köçürüldü. Qız köçürüldü. Tezislər köçürüldü.*

2. Bax **keçirilmək.** *Polad ərizə yazdı komandirinə; Başqa bir hissəyə köçürülməyə.* M.Rahim.

**KÖHLƏN** *sif.* Harın bəslənmiş (at haqqında). *Tövlələrdə köhlən atlar çığırışırmı?* F.Köçərli. *Volqadan su içmiş köhlən atların; Üstündə girdablı çaylara cumduq.* S.Vurğun. // İs. mənasında. *Köhləni yəhərləmək. Köhləni minmək. – Sən mənim köhlənim, oynaq atımsan.* M.Müşfiq. [İlyas:] *Tərlan kimi coşqun məzaclı bir köhləni isə yalnız minicilik sənətkarlığının zirvəsində duran tək-tək adamlar minə bilərdi.* Ə.Məmmədxanlı.

**KÖHLƏNLİK** *is.* Harın bəslənmiş atın hal və keyfiyyəti; harınlıq. *Qara oğlan hər söz başında xallı atın köhlənliyini, cinsliyini, yumşaqlıq və mehribanlığını deyib, özünü öyür və tərifləyirdi.* S.Rəhimov.

**KÖHNƏ** *sif.* [*fars.*] 1. Uzun müddət işlənməkdən dağılmış, xarab olmuş, yıpranmış, köhnəlmiş; nimdaş (*yeni* ziddi). *Köhnə ayaqqabı. Köhnə palto. Köhnə araba. Köhnə stul. – Pişxidmətlər şüru etdilər Yusif Sərracın köhnə paltarını soyundurmağa və xələtişahanəni ona geydirməyə.* M.F.Axundzadə. *Üstünə köhnə bir cecim atılıb; Çarvadarlar gün altda yatmışdır.* A.Səhhət. *Ələsgər dayı özü ilə Kürdüstandan kim bilir hansı zamandan qalmış köhnə bir saz gətirmişdi.* İ.Əfəndiyev. // Çoxdan qalan (saxlanan). *Köhnə çaxır. Köhnə sirkə.*

2. Bundan öncə olan, əvvəlki, sabiq, keçmiş (*təzə* ziddi). *Köhnə direktor. Köhnə rəis. Köhnə sədr. –* [Miraxur:] *Sən Allah, Mirzə Həbib, de görüm xalq bizim köhnə padşahımızın haqqında nə danışır?* M.F.Axundzadə. *Bir bax gör köhnə briqadir yerində nə qurdalanır?* Q.İlkin.

3. Çoxdan qalma, keçmiş, çoxdan işlənən, indiyədək davam edən, keçmişə aid olan, vaxtı keçmiş. *Köhnə üsul. Köhnə qayda. – Aşkar şeydir ki, təzə olan yerdə köhnə qanunlar gərək pozulsunlar.* C.Məmmədquluzadə. *Köhnə istibdad düşdü, parladı tərzicədid.* Ə.Qəmküsar. *Gənclərimizin köhnə adət və etiqadların təsirinə düşmələrinə dözmək olmaz.* Ə.Sadıq.

4. Qədim, keçmiş dövrə aid, əski. *Köhnə şəhər divarları. Köhnə bina. Köhnə abidələr. – Köhnə Azərbaycanın uzaq bir bucağında; Qoca Həsən dayının alçaq koması vardı.* R.Rza. *Cavad kəndin qabağındakı köhnə qala yerlərini nəzərdən keçirtdi.* Ə.Vəliyev. *Səngərdir başdan-başa o köhnə Mədinənin; Hər küçəsi, hər tini.* B.Vahabzadə.

5. Təcrübəli, qocaman, stajlı, dünyagörmüş, bir işdə çox işləyib bişmiş; bişkin. *Köhnə müəllim. Köhnə xanəndə. Köhnə usta. – Düzdür, Bayram kişi özü köhnə ovçu idi.* M.Rzaquluzadə. // Yaşlı, qoca, yaşca daha böyük. *Köhnə kişi. Köhnə qadın. – Bəzi köhnə yaşlı kişilər və bir para Allah bəndələrindən başqa onu sayan, ona həmişəki ehtiramı edən yox idi.* Qantəmir. [Sultan:] *Axırda, cavanlarımıza yumruq dəyəndə də .. bar-bar bağırdılar ki, bəs ay nə bilim, köhnə kadrlar bizim qabağımızı kəsirlər, bizə post vermirlər!..* İ.Hüseynov. // İs. mənasında (əsasən cəmdə işlədilir). *Köhnələrin fikri. – O köhnələrdən əcəb kim, utanmayıb da, deyirlər; Gərək bu əsrə görə böylə, böylə adət olaydı!* M.Ə.Sabir.

6. Çoxdankı, lap əvvəlindən, əski. *Köhnə şəhərli. Köhnə tanış. – Yox yeni bir dinə yəqinim mənim; Köhnə müsəlmanəm, a şirvanlılar!* M.Ə.Sabir. *Yarım saatdan sonra neçə nəfər köhnə rəfiqlərlə Şaban daxil oldu.* Ə.Haqverdiyev. *Sən mənə tanışsan, mən sənə tanış; Bu köhnə dostunu tanı, bənövşə!* M.Dilbazi.

7. Mürtəce, vaxtı keçmiş, indiki dövrə uyğun gəlməyən (*yeni* ziddi). *Köhnə fikir. Köhnə əqidə. – "Molla Nəsrəddin" çürümüş, köhnə, yaramaz, üfunət saçan həyat və ictimai əlaqələrin hərtərəfli və öldürücü tənqidçisidir.* M.İbrahimov.

◊ **Köhnə hamam, köhnə tas** – bax **əski hamam, əski tas ("əski[1]"də). Köhnədən vurub təzədən çıxmaq** – həm köhnədən,

həm təzədən, hər şey haqqında danışmaq. *..Mürşüdoğlu nağıla başlayıb köhnədən vurub təzədən çıxdı.* S.Rəhimov.

**köhnə-köhnə** *sif.* və *zərf* Köhnə, əski, qədim (çoxluq bildirir). *Köhnə-köhnə fikirlərlə mübarizə aparmaq.* – [Şahqulu:] *Rəhmətliyin oğlu, köhnə-köhnə peşəni əldən qoymayıb korlayırsan.* N.Vəzirov.

**KÖHNƏÇİ** *is.* 1. B a x **köhnəpərəst.**

2. Köhnə paltar və s. alıb-satan adam; köhnəfüruş.

**KÖHNƏÇİLİK** b a x **köhnəpərəstlik.**

**KÖHNƏDƏN** b a x **qədimdən.**

◊ **Köhnədən qalma** – keçmiş zamanlardan qalan, çoxdan qalma; köhnə, əski, qədim. *Əmizadələrimin köhnədən qalma bir qara damı var idi. Orada heç kəs olmurdu. Məhsul saxlamaq üçün anbar idi.* S.S.Axundov.

**KÖHNƏFÜRUŞ** *is.* [*fars.*] b a x **köhnəçi** 2-ci mənada.

**KÖHNƏ-KÜLTƏ** b a x **köhnə-kürüş.** *Bundan qabaq həyətə yolçu-zad gələndə pay verərdim, .. köhnədən-kültədən bağışlardım.* Ə.Əbülhəsən.

**KÖHNƏ-KÜRÜŞ** *sif.* Çox köhnə, istifadəyə yaramayan; cındır, dağılmış, cırılmış. *Köhnə-kürüş şeyləri təmir etmək.* // İs. mənasında. *Köhnə-kürüş satmaq.*

**KÖHNƏLDİLMƏ** "Köhnəldilmək"dən *f.is.*

**KÖHNƏLDİLMƏK** *məch.* İşlədilə-işlədilə köhnə hala gətirilmək, xarab edilmək, yıpradılmaq.

**KÖHNƏLƏŞMƏ** "Köhnələşmək"dən *f.is.*

**KÖHNƏLƏŞMƏK** b a x **köhnəlmək.** *Palto köhnələşib. Xalça köhnələşdi.*

**KÖHNƏLİK** *is.* 1. Köhnə şeyin hal və keyfiyyəti (*təzəlik* ziddi). *Paltarın köhnəliyi. Evin köhnəliyi.* // Tarixi köhnə olma, keçmişə aid olma. *Məsələnin köhnəliyi.*

2. Dövrə, zəmanəyə uyğun olmayan şeylər; əskilik, gerilik (*yenilik* ziddi). *Bütün o Şərq köhnəliyi aradan qaldırılmış, onun yerində təzə və təmiz bir bağ salınmışdır.* C.Cabbarlı. *Bizim evdə köhnəliklə yeniliyin mübarizəsi əsla qurtarası deyildir!* S.Rəhimov.

**KÖHNƏLMƏ** "Köhnəlmək"dən *f.is.*

**KÖHNƏLMƏK** *f.* 1. Çox işlənməkdən xarab olmaq, yıpranmaq, yararsız hala gəlmək. *Pencək köhnəlib. Ayaqqabı köhnəldi.*

2. Çox qalmaqdan xarab olmaq, təzəliyini, təravətini itirmək, yaramaz olmaq. *Yağ* (*pendir*) *qalıb köhnəlib.*

3. Vaxtı keçmək, dəbdən düşmək, az işlənmək, az istifadə olunmaq, günün tələblərinə cavab verməmək, bu gün üçün yaramamaq. *Çıxarılan nəticələr köhnəlibdir. İfadələr köhnəlibdir. Bu məsəl də indi bir çoxları kimi köhnəlmişdir.* M.Rzaquluzadə.

**KÖHNƏLMİŞ** *f.sif.* 1. Çox işlənməkdən xarab olmuş; yıpranmış. *Köhnəlmiş papaq. Köhnəlmiş şal.* [Hacı Manaf] *məhkəməyə gələrkən olduqca köhnəlmiş, yamaqlı bir paltar geyərək gəlmişdi.* S.Hüseyn. [Qədir] *başına köhnəlmiş və hər tərəfini yağ basmış bir meşin şapka qoymuşdu.* Ə.Sadıq. *Minayə köhnəlmiş, bir neçə dili də xarab olmuş qarmonu döşünə basıb .. ortalıqda süzürdü.* Ə.Əbülhəsən.

2. Çox qalmaqdan xarab olmuş, təzəliyini, təravətini itirmiş. *Köhnəlmiş yağ* (*pendir*).

3. Dövrə, zəmanəyə, bugünkü günə uyğun olmayan; dəbdən düşmüş, indi işlənməyən. *Köhnəlmiş nəzəriyyə. Köhnəlmiş söz* (*ifadə*).

**KÖHNƏLTMƏ** "Köhnəltmək"dən *f.is.*

**KÖHNƏLTMƏK** *f.* İşlədə-işlədə köhnə hala gətirmək, xarab etmək. *Pencəyi köhnəltmək.*

**KÖHNƏPƏRƏST** *is.* [*fars.*] Köhnəlik tərəfdarı, köhnə adət və ənənələri sevən, onlara riayət edən, onlardan əl çəkməyən adam; mühafizəkar, cəhalətpərəst. *..Bizim köhnəpərəstliyimiz və müqəddəslərimiz görürlər ki, biz hər bir qüvvəmizi məhz məktəb açmağa sərf eliyirik..* C.Məmmədquluzadə. *Ev və ailə məsələlərində bir qədər köhnəpərəst olan atasını* [Züleyxa] *bərk narahat edirdi.* M.İbrahimov.

**KÖHNƏPƏRƏSTLİK** *is.* Köhnəlik tərəfdarı olma, köhnə adət və ənənələri sevmə; mühafizəkarlıq, cəhalətpərəstlik.

**KÖHNƏSAYAQ** *sif.* və *zərf* Köhnə tərzdə, köhnə qaydada, köhnədə olduğu kimi.

**KÖHÜL** *is.* Mağara. [Cuma] *..yaş torpaq iyi verən bu qaranlıq köhülün ora-burasını yoxlayaraq, büzüşüb dirsəkləndi.* Ə.Əbülhəsən. ☐ **Köhül kimi** *məc.* – mağara kimi. *Yüzlərcə at ağzını köhül kimi açıb fınxıra-fınxıra Qarabağ atının üzərinə cummuşdu.* M.S.Ordubadi.

**KÖK**[1] *is.* 1. Bitkilərin torpaq altında olan, suyu soran və onları qidalı maddələrlə qidalandıran yarpaqsız hissəsi; rişə. *Ot öz kökü üstündə bitər.* (Ata. sözü). *Biçinçilərdən biri orağını böyük bir qanqalın kökündən endirərkən quş balaları "cik-cik" edib .. qalın otlar arasına soxuldular.* A.Şaiq. *Kökləri kəsilmiş ağaclar gurultu ilə yıxılırdı.* H.Seyidbəyli. // Bitkilərin müəyyən məqsəd üçün qazılıb çıxarılan yeraltı hissəsi. *Biyan kökü. Tikan kökü.* // Kökümeyvəli bitkilərin ərzaq kimi işlədilən yeraltı hissəsi (kartof, soğan və s.).

2. Sarı, sarı-qırmızı, qara rəngli kökümeyvəli bitkilərdən birinin adı; yerkökü. *Bazardan kök almaq. Kök şirəsi. – Aslan əlinə bir kök alıb xırtıldada-xırtıldada yeməyə başladı.* S.Vəliyev.

3. Saçın, dişin və s.-nin bədənin içində olan hissəsi. *Diş kökü. Saçın kökü.* // Bədən üzvünün bədənlə birləşən yeri, dib qismi. *Dilin kökü.*

4. *məc.* Nəsil, əsil-nəsəb, mənşə. *Mənim ki başımın tükləri ömrümdə qıvrım olmamışdır, .. nəslimizdə, kökümüzdə də olmamışdır.* S.Rəhimov.

5. *dilç.* Sözün önlük və şəkilçiləri çıxdıqdan sonra qalan hissəsi. *Sözün kökü. Bir kökdən ibarət sözlər.*

6. *riyaz.* Müəyyən dərəcəyə qaldırdıqda yeni bir kəmiyyət alınan ədəd. *Kvadrat kök.*

7. *məc.* Əsas səbəb, əsas illət. *Məsələnin* (*işin*) *kökü. – Bu hadisələrin əsas kökü azərbaycanlıları paytaxtdan uzaqlaşdırmaq və Qızıl Arslanı təkləmək məqsədləri üzərində qurulmuşdu.* M.S.Ordubadi.

8. **Kökündən** şəklində – 1) əsla, qətiyyən. [Niyaz:] *Belə iş bu küləkdə; Mümkün deyil kökündən.* Ə.Əlibəyli; 2) tamamilə, yerli-dibli. *Həyat kökündən dəyişmişdir. – Mümkün olsa lap kökündən qaldırıb bir zənn ilə; Cümlə mətbuatı viran etməli bundan sora.* M.Ə.Sabir.

◊ **Kök aparmaq** – bax **kök salmaq** 2-ci mənada. *Həqiqət halda da dörd gün davam edən məhkəmə, mühitimizdə az-az təsadüf edilən, amma əsası yaşayışımızın dərinliklərinə kök aparan bir işə baxırdı.* T.Ş.Simurq. **Kök atmaq** – 1) bitkilərin torpaq altında olan hissəsində köklər əmələ gəlmək; rişələnmək, yayılmaq. *Elə bil ki, Dəmirçioğlu yüzillik bir ağac olub yerə kök atmışdı.* "Koroğlu"; 2) *məc.* bir yerdə törəyib artmaq. [Dərviş:] *Canımın bir hissəsi vətənimdə hasil olubsa, o biri ləzzətli, dadlı hissəsi bu dağların aralarında .. kök atıbdır!* A.Divanbəyoğlu. **Kök salmaq** – 1) bax **kök atmaq**. *Bu körpəcə meynəni qoru hər bir zavaldan; Qoy torpaqda kök salıb, bərkitsin öz yerini.* S.Rüstəm; 2) *məc.* yer tutmaq, möhkəmlənmək, möhkəm və həmişəlik yerləşmək. *Əl yarası tez gedər; Kök salar dil yarası.* (Ata. sözü). *Cəlil ağanın .. qəlbində kök salmış qəbih adətləri ona tərk etdirmək mümkün deyildi.* İ.Musabəyov. [Fətullanın] *şəhərə yaxın kəndlərdən birində evlənib kök saldığını bilirdim.* Mir Cəlal. **Kökü (kökünüz, kökləri) kəsilsin!** – qarğış, nifrin ifadəsi. *Onların, görüm, kökləri kəsilsin!* **Kökü kəsilmək** – 1) tamamilə yox edilmək, məhv edilmək, puç edilmək; yox olmaq. *Dostların əlilə bir tikan təki; Belə adamların kəsilər kökü.* S.Rüstəm. [Süleyman:] *Bataqlıq qurudulub, yerində meşə zolaqları və tarlalar salındıqdan sonra qızdırmanın kökü kəsildi.* M.Rzaquluzadə; 2) tələf olmaq, mövcud olmamaq, nəsli kəsilmək. *Abşeronda çoxdan kökü kəsilmiş canavar, tülkü, çaqqal kimi ziyanverən heyvanlar haradansa peyda olub.* M.Rzaquluzadə. **Kökündən vurmaq** – 1) dibindən kəsmək, görünməz etmək, yox etmək. *Saçını kökündən vurmaq;* 2) *məc.* tutarlı söz demək, kəsərli cavab vermək. **Kökünə çatmaq** – əsasını, mahiyyətini bilmək, dərindən öyrənmək, künhünə varmaq. [Xan:] *Axund, çox zehinli uşaqdır.. Hər nə də görür, soruşub kökünə çatmaq istəyir.* Çəmənzəminli. **Kökünü (yer üzündən) kəsmək** – tamamilə, bir daha törəməyəcək şəkildə yox etmək, məhv etmək. *Yalnız bu yolu davam etdirməklə zülmün kökünü kəsmək mümkündür.* M.S.Ordubadi. *Kəssin deyə düşmənin kökünü yer üzündən; Qoymaram korluq çəkə benzindən onları mən.* R.Rza. **Kökünü qazımaq** – 1) bax **kökünü kəsmək.** [Hacı Mehdi:] *Allah sizin kökünüzü yerdən qazsın.* Ə.Haqverdiyev; 2) *məc.* əleyhinə iş görmək, zərərinə işləmək. *Özünü dost kimi göstərən çar hökuməti gizlində xalqın kökünü qazıyırdı.* A.Şaiq.

**KÖK**[2] *sif.* 1. Ətli, şişman, gonbul, yoğun (*arıq* ziddi). *Kök uşaq. Kök qoyun. Kök adam. – Həsrət ilə pişik çəkirdi keşik; Gördü gəlir neçə qəvi, kök pişik.* S.Ə.Şirvani. [Qurbanəli:] *Baş üstə!.. Sən məni bu işdən xilas eləsən mən sənə hələ bir kök toğlu da bağışlaram.* N.Vəzirov. [Arvad:] ..*Hinduşkanın bir kökünü tut, kəs.* B.Bayramov.

2. *məc. dan.* Özündən sonra gələn sözün qüvvətini, mənasını, təsirini gücləndirir. *Əvəzində Qəhrəmandan bir kök töhmət al, eləmi? – deyə Əsəd donquldana-donquldana başını yellədi.* S.Rəhimov. *Sitarə kök bir dəstə hazırlamışdı.* Mir Cəlal. [Nəcmi] *xüsusən axırıncı sinifdə ən çox hirsini boğazına yığan şagirdə kök bir sıfır verər.* Ə.Əbülhəsən.

**KÖK**[3] *is.* Musiqi ifadəliyinin vəzn, tembr və s. kimi ünsürlərindən biri. *Müxtəlif yüksəklikdə olan səslərin müəyyən sistem əsasında təşkil olunması ilə əldə edilən səslərin qarşılıqlı münasibətinə kök deyilir.* Ə.Bədəlbəyli. // Simli musiqi alətlərində kökləməklə səslərdə yaradılan qarşılıqlı ahəng; həmahənglik. *Musiqi ifadəliyinin bir çox mühüm ünsürləri (kök, vəzn, tembr və sairə) məhz melodiyanın tərkibində birləşərək bir vəhdət təşkil edir.* Ə.Bədəlbəyli. ☐ **Kök etmək (eləmək)** – 1) b a x **kökləmək**[1]. *Tarı kök etmək. – Bu hində Baxşı kamançanı kök eləyir və başlayır segah-zabil havasını çalmağa.* C.Məmmədquluzadə; 2) *məc.* sazlamaq, hazırlamaq. [Rəşid:] *Hə, Qurbanqulu belə evləndi, – deyib, qəlyanını kök etməyə başladı.* T.Ş.Simurq. **Kökdən düşmək** – simləri boşalmaq, kök (tarım) olmamaq, həmahəngliyini itirmək (tar, kamança və s.-də). *İllərin tozu basmış, düşmüşdü kökdən simi; Bir də onu çalmağa heç gəlmirdi gümanı.* Ə.Cəmil.

**KÖK**[4] *is.* 1. İri tikiş.

2. Sonradan əl və ya maşınla əsaslı tikmək üçün atılan iri tikiş. ☐ **Kök atmaq (getmək)** – b a x **kökləmək**[2].

**KÖK**[5] Adətən tərkiblərdə işlənib, xarici görünüş, vəziyyət, hal, halət mənasını verir. *Pis kökdə görmək* (pis vəziyyətdə görmək). *Öz kökünə qoymaq* (özü kimi etmək). – [Mahmud:] *Adəmi behiştdən qovdular, onlar da düşdülər mən kökə.* Ə.Haqverdiyev. [Möhsün:] *Musa, gətir, bu kökdə şəklimizi çəkdir.* Mir Cəlal.

◊ **...kökə qoymaq** – b a x **...kökə salmaq.** *Bilmirəm niyə belə oldu? Bu oxumaq səni nə kökə qoydu?* S.Rəhimov. **...kökə düşmək** – **...vəziyyətinə, ...halına düşmək.** *Belədir qayda, nəhayət, düşəcəkdir bu kökə...* S.Rüstəm. *Mahmudun .. sənədləri, kim bilir, nə kökə düşmüşdür.* Ə.Əbülhəsən. **...kökə salmaq** – ...vəziyyətinə, ...halına, ...şəklinə (...vəziyyətə, ...hala, şəklə) salmaq. *Pis kökə salmaq.* – [Tacirlərdən biri:] *Başına dönüm, Qaçaq Nəbi, bizim var-yoxumuzu əlimizdən alıb, özümüzü də bu kökə saldı.* “Qaçaq Nəbi”. [Ələsgər:] *A boyunu yerə soxum, beyni olan da iki arvad alıb, özünü bu kökə salarmı?* Ə.Haqverdiyev. *Yığışıb min dənə şeytan balası hər tükünə; İstəyirsən məni də lap salasan öz kökünə?* Ə.Nəzmi.

**KÖKALMA** *is. riyaz.* Ədədin kvadrata yüksəldilməsi, ədədin özünə vurulması. *Qüvvətə yüksəlmənin tərsi olan kökalma əməli də riyaziyyata irrasional ədədləri daxil etmişdir..* Z.Xəlilov.

**KÖKAYAQLILAR** *cəm zool.* Bədənindəki çıxıntıların köməyi ilə hərəkət edən və qidanı tutan ən sadə birhüceyrəli heyvanlar sinfi. *İbtidai heyvanlara dair dərsləri keçərkən mikroskop altında öyrəniləcək heyvanlardan biri də kökayaqlılar sinfindən olan amyöbdür.* C. Cəbrayılbəyli.

**KÖKCÜK** *is.* Balaca kök, kiçik kök. *Otun kökcüyü. – Zəfəran budaqlanmayan sapabənzər kökcüyə malikdir ki, bunun da bütün uzunluğu boyu diametri 1 mm-ə qədər olur.* İ.Axundzadə.

**KÖKDOĞRAYAN** *sif. k.t.* Bitki köklərini doğramaq, xırdalamaq üçün olan. *Kökdoğrayan maşın. // is.* Kökü doğramaq, xırdalamaq üçün maşın və s. *Kökdoğrayanı quraşdırmaq.*

**KÖKƏ** *is. dan.* Adi xəmirdən bişirilən kiçik çörək; qoğal. *Nə yoğurdum, nə yapdım; Hazırca kökə tapdım.* (Ata. sözü). *Tapdıq sualını təkrar etdikdə Qaçay cavab verdi: – Balama şirin dəyirman kökəsi gətirmişəm.* Ə.Vəliyev. *Mayil eyvanda kökə yeyirdi.* Mir Cəlal.

**KÖKƏCİK** *is.* Kiçik kökə, balaca qoğal: qoğalcıq.

**KÖKƏLDİCİ** *sif.* Kökəldən, kökəlməyə səbəb olan, kömək edən. *Kökəldici yeməklər* (*maddələr*).

**KÖKƏLDİLMƏ** "Kökəldilmək"dən *f.is.* *Mal-qaranın kökəldilməsi.*

**KÖKƏLDİLMƏK** *məch.* Yaxşı yemək verməklə, qulluq etməklə kök hala gətirilmək.

**KÖKƏLMƏ** "Kökəlmək"dən *f.is.*

**KÖKƏLMƏK** *f.* Yaxşı yemək, bəslənmək, qulluq edilmək nəticəsində kök hala gəlmək, ətə-cana gəlmək. *Uşaq kökəlib. Bu qoyunlar yaxşı kökəldi.* – [İzzət Məmmədhəsən əmiyə:] *Bəs ha vaxt* [eşşək] *evdə qalıb kökələcək ki, sən onu minəsən, ziyarətə gedəsən?* C.Məmmədquluzadə. [Kəblə Haşım:] *Mən hər il orucluqda azından on girvənkə kökəlirəm.* S.Hüseyn. ◻ **Kefi kökəlmək** – bax **kef.**

**KÖKƏLTMƏ** "Kökəltmək"dən *f.is.*

**KÖKƏLTMƏK** *f.* Yaxşı yemləmək, bəsləmək, qulluq etməklə kök hala gətirmək; kökəlməyə səbəb olmaq. *Toyuqları kökəltmək. Uşağı kökəltmək. Yağlı süd uşağı kökəldər.*

**KÖKKƏSƏN** bax **kökdoğrayan.**

**KÖKLƏMƏ¹** "Kökləmək¹"dən *f.is.*

**KÖKLƏMƏ²** "Kökləmək²"dən *f.is.*

**KÖKLƏMƏK¹** *f.* 1. Simli musiqi alətlərinin səsini simləri tarımlaşdırmaq, ya boşaltmaq yolu ilə tələb olunan tona salmaq, simlərinin ahəngini bir-birinə uyğunlaşdırmaq. *Aşıq Cünun sazını kökləyib ortaya çıxdı.* "Koroğlu". *Bu hində Baxşı kamançanı kökləyir və başlayır segah-zabil havasını çalmağa.* C.Məmmədquluzadə.

2. *məc.* Sazlamaq, düzəltmək, işə salmaq üçün hazırlamaq. *Hüseynəli əmi çubuğunu dəmir milçə ilə qurdalayıb kökləyirdi.* M.S.Ordubadi. *Qışın gecəsi uzun, odunumuz bol, işimiz də yox.. Götür çörəyini ye, ocağı da köklə.* Ə.Vəliyev.

**KÖKLƏMƏK²** *f.* Paltar biçildikdən sonra kəsilmiş hissələri iri tikişlə bir-birinə quraşdırıb tikmək. *Paltarı kökləmək.*

**KÖKLƏNMƏ¹** "Köklənmək¹"dən *f.is.*

**KÖKLƏNMƏ²** "Köklənmək²"dən *f.is.*

**KÖKLƏNMƏ³** "Köklənmək³"dən *f.is.*

**KÖKLƏNMƏK¹** *məch.* 1. Musiqi alətlərində: səsləri lazımi tona salınmaq, simləri bir-birinə uyğunlaşdırılmaq. *Kamançalar köklənib.*

2. *məc.* Sazlanmaq, saz hala gətirilmək. *Qəlyan kökləndi.*

**KÖKLƏNMƏK²** *qayıd.* Bir yerdə kök salmaq, möhkəmlənmək.

**KÖKLƏNMƏK³** *məch.* İri-iri tikilmək. *Paltarın ətəyi köklənib.*

**KÖKLƏNMİŞ** *f.sif.* Köklənmək yolu ilə səsləri lazımi tona salınmış. *Rüstəmin işi gətirəndə həmişə köklənmiş tar kimi əl dəyməmiş səslənərdi.* M.İbrahimov.

**KÖKLƏŞDİRMƏ¹** "Kökləşdirmək¹"dən *f.is.*

**KÖKLƏŞDİRMƏ²** "Kökləşdirmək²"dən *f.is.*

**KÖKLƏŞDİRMƏK¹** *f.* Kök hala gətirmək; kökəltmək.

**KÖKLƏŞDİRMƏK²** *f.* Əsaslandırmaq, möhkəmləndirmək.

**KÖKLƏŞMƏ¹** "Kökləşmək¹"dən *f.is.*

**KÖKLƏŞMƏ²** "Kökləşmək²"dən *f.is.*

**KÖKLƏŞMƏK¹** *f.* Kökəlmək.

**KÖKLƏŞMƏK²** *f.* Kök salmaq, kök atmaq, möhkəmlənmək, bərkimək. *İllərcə kökləşmiş olan bu adəti sonralardan tərgitmək olmur.* F.Ağazadə.

**KÖKLÜ** *sif.* 1. Torpaq altında kökü, rişələri olan. // Kökü üstündə olan, kökü ilə birlikdə. *Kür çayı bəndini yaz yaran kimi; Köklü ağacları aparan kimi; Yardılar Qazaxın səfini fövrən.* H.K.Sanılı. *Köklü ağac kimi qopub yerimdən; Uçuram bir dərin boşluğa sarı.* S.Vurğun.

2. *məc.* Yekə, böyük, möhkəm. *Köklü qaya.* [Firəngiz Şahinə:] *Maşınımız köklü daşa ilişib, buna işığın nə köməyi dəyəcəkdir?* B.Bayramov.

3. *məc.* Çoxlu qohum-əqrəbası, böyük nəsli olan. *Köklü adam. Köklü ailə.*

**KÖKLÜ-BUDAQLI** *sif.* 1. İri, böyük, inkişaf etmiş, yoğun və qollu-budaqlı. *Köklü-budaqlı qarağac. Köklü-budaqlı çinar. // zərf mənasında.* Kökü və budaqları ilə birlikdə; tamamilə. *Maşınla ağacları; Tamam köklü-budaqlı çıxardırlar. Orda sən; Cərgə ilə əkərsən.* M.Rahim.

2. *məc.* bax **köklü** 3-cü mənada. *Köklü-budaqlı ailə. – Meşinov bu rayonda hər kəsi*

*gəldi-gedər hesab edər, yalnız özünü köklü-budaqlı bir adam sayardı.* S.Rəhimov.

**KÖKLÜ-GÖVDƏLİ** bax **köklü-budaqlı** 1-ci mənada. *Köklü-gövdəli tut ağacı. – ..Yayın daşqın günlərində bu çay köklü-gövdəli palıd, söyüd gətirib adamın zəhləsini tökürdü.* S.Rəhimov.

**KÖKLÜK**[1] *is.* Adamın və ya heyvanın ətlilik-canlılıq cəhətdən hal və vəziyyəti. *Köklükdən gəzə bilməmək. Otlaq dövründən sonra mal-qaranın köklüyü xeyli artır.*

**KÖKLÜK**[2] *is.* Musiqi alətlərində simlərin səslənməsinin bir-birinə uyğunluq vəziyyəti. *Tarın köklüyünü yoxlamaq.*

**KÖKLÜK**[3] *is.* Çoxlu kök (yerkökü) əkilmiş yer. *Köklüyü sulamaq. Köklüyü alaq etmək.*

**KÖKLÜ-KÖMƏCLİ** 1. Bax **köklü-budaqlı** 1-ci mənada. *Köklü-köməcli ağac.*

2. Bax **köklü-budaqlı** 2-ci mənada. [Hümmət:] *Rayonda köklü-köməcli bir adam tapmaq, on iki imama yalvarınca bir Allahın ətəyindən yapışmaq lazımdır.* B.Bayramov.

**KÖKS** 1. Bax **döş** 1-ci mənada. *Köks qəfəsi. – Zahirən heyrətamiz dərəcədə sadə və sakit olan bu balacaboylu insanın köksündə bu qədər zəngin və güclü bir ürək yaratmış təbiətin ecazına heyran qalmamaq olmazdı.* M.İbrahimov. [Vahid:] *Bu sözləri eşidəndə az qaldı ürəyim köksümü yarıb çıxsın.* B.Bayramov.

2. *məc.* Ürək mənasında. *Çəkilib köksümə dağlar, düyünlər.* Q.Zakir. *Anaxanım .. köksünü sıxmaqda olan kədərlərini bölüşmək üçün Atabalanın yolunu gözləməyə başladı.* A.Şaiq. *Mən bir dövürdəyəm ki, tunc qanadlanır; Qara daşın, mərmərin köksü atlanır.* M.Müşfiq.

◊ **Köks dolusu** – dərindən, sinəsi tutduqca. *Köks dolusu nəfəs almaq.* **Köks keçirmək** – bax **köksünü ötürmək**. *Mütərəddid vəziyyətlər, baxışlar, köks keçirmələr bir-birini təqib edirdi.* M.S.Ordubadi. **Köks(ünü) gərmək** – özünü qorxmadan qabağa vermək, döşünü qabağa vermək, sinə gərmək, müqavimət göstərmək. *Qanlı süngülərə gərmiş köksünü; Qanilə yazmışdır hər qalib günü.* S.Vurğun. *Yollarındakı bütün bəla və müsibətlərə köks gərən haqq aşıqları, nağılların dediyinə görə, yuxularında gördükləri sevgililərinə qovuşmaq üçün yola düşürdülər..* Ə.Məmmədxanlı. **Köksünü ötürmək** – dərindən nəfəs almaq (fikirdən, qüssədən, qəmdən və s. hisslərin təsirindən). *Camaat harada idi ki, səs-səmir də çıxa idi, – deyə, qoca köksünü ötürdü.* Ə.Məmmədxanlı. *Məzlum dərindən köksünü ötürdü.* S.Vəliyev.

**KÖK-SAQQIZ** *is. bot.* Kauçuk verən çoxillik ot-bitki. *Kök-saqqız .. çoxillik ot bitkisidir, acıqovuna oxşayır.* M.Qasımov.

**KÖKSÜDOLU** *sif.* 1. Ətli, iri döşlü. *Köksüdolu qadın.*

2. Bax **köksüdolusu.** [Nazxanım] *..köksüdolu nəfəs aldı.* İ.Əfəndiyev.

**KÖKSÜDOLUSU** *zərf* Rahat, dolğun, geniş, dərindən. *Köksüdolusu nəfəs almaq.*

**KÖKSÜZ** *sif.* Kökü, rişəsi olmayan. *Köksüz ot. – Köksüz ağacı becərməkmi olar?* N.Nərimanov.

**KÖKÜMSOV** *sif. bot.* Gövdəsinin əsas hissəsi yerin altında olan (bitki). [Herbari üçün] *yığılan bitkinin gövdəsi, çiçəyi, kökü, kökümsovu və ya soğanaqlı bitkidirsə, soğanağı olmalıdır.* H.Qədirov.

**KÖKYUYAN** *sif.* Kök yumaq üçün olan (maşın və *s.*) // *is.* Kök yumaq üçün maşın və s. *Kökyuyanı təmir etmək.*

**KÖLƏ** *is.* Quldarlıq və feodalizm cəmiyyətində: bütün hüquq və istehsal vasitələrindən məhrum və sahibkarın xüsusi mülkiyyəti olan adam; qul. *Hər uçuğun altında var min kölənin məqbəri; Hər parça daş bir fəqirin sinəsinin mərməri.* M.S.Ordubadi. [Xəyyam:] *Xəyyama nə lazımdı ki, zəncir; Onsuz da köləndir, bu nə təhqir?* H.Cavid. *Qanun var ki, insanları kölə etmiş dünyada; Qanun var ki, qulluq yazmış babalardan övlada.* N.Rəfibəyli.

**KÖLƏCƏSİNƏ** *zərf* Kölə kimi, qul kimi; yaltaqcasına. *Köləcəsinə yaşamaq.*

**KÖLƏLİK** *is.* 1. Kölənin, qulun vəziyyəti, halı; qulluq. *Bəxtiyar arzular elə bir dünya; Ağalıq, köləlik olmasın orda.* S.Vurğun. *Köləlik dünyasından qalmasın deyə bir iz; Cəbhələrdə döyüşdük düşmənlərlə döş-döşə.* S.Rüstəm.

2. Əsarət. *Köləliyə, əsarətə; Qara məzar qazıldı.* N.Rəfibəyli.

**KÖLGƏ** *is.* 1. Qarşı tərəfdən işıq düşən hər hansı bir şeyin qara əksi. *Binanın kölgəsi.*

*Kölgəsi yerə düşmək. – ..Kəndlilər gəlib çömbəliblər tayanın kölgəsində.* C.Məmmədquluzadə. *Bizim bağa su axıdır açdığın bərə; Bizim tutdan sizin bağa kölgə düşəcək.* M.Araz. ☐ **Kölgə salmaq** – b a x **kölgələmək.** *Ağac kölgə salmışdı. – Az qala başım yetişə göylərə; Şax-budağım kölgə salıb hər yerə.* M.Ə.Sabir. *..Ərik və tut ağacları baş-başa verərək, günün qabağını çətir kimi tutur, yaşıl otların, tər yoncaların üzərinə sərin kölgə salırdı.* İ.Əfəndiyev. // *məc.* İnsanın daxili hiss və həyəcanının üzündə, gözündə ifadəsi, təcəssümü. *Qəm kölgəsi üzünü bürüdü. – Yorğunluğun kölgəsi; Sıralanmış alnının; Qırışıq izlərində.* R.Rza. *Balaca Nərgizin üzündən bir kölgə keçdi.* Ə.Məmmədxanlı. // İşıq şüalarının bilavasitə düşmədiyi yer, sahə: kölgə yer, kölgəlik. *Kölgədə oturmaq. Kölgə tərəfə keçmək. – Divar dibində kölgədə xoruz, toyuqlar uyqular..* A.Səhhət. [Alış nazirə:] *Gəlin, barı gedək, bir kölgədə dincəlin.* B.Bayramov.

2. Rəsmdə və ya şəkildə təsvir edilən hər hansı bir şeyin az işıq düşən hissəsi.

3. Qaranlıqda, dumanda aydın görünməyən şey; qaraltı. *Kölgə kimi seçilmək. – Uzaqdan bir kölgə* [Səlim və Mehribanı] *pusur, gizlicə təqib edirdi.* S.Hüseyn. *Yağışdan qorxmadı, boran bilmədi; Onu sarsıtmadı hənirti, kölgə.* M.Rahim. *Qayınana ilə gəlin şirin danışdıqları zaman qapıda bir kölgə göründü.* Ə.Vəliyev.

4. Əks, şəkil mənasında. *Suda öz kölgəsini görüb o zaman; Sandı bir özgə itdir ol heyvan*. A.Səhhət.

5. *məc.* **Kölgənizdə, kölgəsində** şəklində *məc.* – köməyinizlə (köməyi ilə), himayənizdə (himayəsində), sayənizdə (sayəsində). [Uşaqlar] *ancaq sizin kölgənizdə oxuyub dərsi tamam ediblər.* Ə.Haqverdiyev. [Allahqulu:] *Allah onlara kömək eləsin, onların kölgəsində gəlib çıxdım.* Çəmənzəminli.

◊ **Kölgədə qalmaq** – gözə görünməmək, üzə çıxmamaq, tanınmamaq, özünə diqqəti cəlb etməmək. [Sərətan:] *Bir odur təhlükə mənə ölkədə; Önündə şöhrətim qalır kölgədə.* M.Rahim. **...kölgədə qoymaq (buraxmaq)** – 1) ...ikinci yerdə buraxmaq, ...daha irəliyə keçmək, birinci olmaq, diqqət mərkəzində olmaq; 2) fikir verməmək, diqqətsiz buraxmaq, laqeyd baxmaq. **Kölgə kimi** – yanından əl çəkmədən, daim izləyərək, ayrılmadan. *Kölgə kimi izləmək. Kölgə kimi əl çəkməmək.* – [Xavər Arifə:] *Kölgən kimi həp pəsincə qoşdum; Eşqinlə qanadlanıb da uçdum.* H.Cavid. *Səltənət evdən çıxanda Cəlil onu kölgə kimi təqib edir, bir an belə gözdən qoymurdu.* Ə.Vəliyev. *Cuma .. kölgə kimi ondan üzülməyən qadına .. qapını bağlamaq işarəsini verdi..* Ə.Əbülhəsən. **Kölgə salmaq** *məc.* – bürümək, əhatə etmək. *Əcəl başımıza kölgə salmamış; Sizdən "can" eşidim, sizə "can" deyim.* B.Vahabzadə. *Lakin son həftələr Ulduzun gözlərinə böyük bir nigarançılıq kölgə salmışdı.* Ə.Məmmədxanlı. **Kölgəsindən qorxmaq (ürkmək)** – çox qorxaq, ürəksiz adam haqqında. *Kölgəsindən ürkən Məşədi Qulam Ceyranoğlunu titrətmə götürdü.* S.Rəhimov. **Kölgəsini qılınclamaq** – hədələyərək dalınca danışmaq, düşmənçilik etmək. [Balaxanım Dadaşa:] *Sən yüz də o Şiraslanın kölgəsini qılınclayasan, .. heç bir şey apara bilməyəcəksən.* S.Rəhimov.

**KÖLGƏLƏMƏ** "Kölgələmək"dən *f.is.*

**KÖLGƏLƏMƏK** *f.* 1. Kölgə salmaq, kölgədə gizlətmək, kölgə etmək. *Çilingləri basdırdıqdan sonra kölgələmək lazımdır.* // Görünməz etmək, qabağını tutmaq, kölgələndirmək. *İşığı kölgələmək.*

2. *məc.* Qaranlıq etmək: dumanlatmaq. *Xatirələr xəyalını kölgələdi.*

**KÖLGƏLƏNDİRMƏ** "Kölgələndirmək"-dən *f.is.*

**KÖLGƏLƏNDİRMƏK** *f.* 1. Kölgə salmaq, kölgə etmək: qaranlıqlaşdırmaq. *Birdən pəncərəni başqa bir adam kölgələndirdi.* M.Hüseyn.

2. B a x **kölgələmək** 2-ci mənada.

**KÖLGƏLƏNMƏ** "Kölgələnmək"dən *f.is.*

**KÖLGƏLƏNMƏK** *f.* 1. Kölgə düşmək, kölgəli olmaq, kölgə salmaq, bir qədər qaranlıqlaşmaq. *Ağaclar kölgələndi. – ..Dik yuxarı dırmandıqca meşə kölgələnib sərinlənirdi.* Ə.Əbülhəsən.

2. Kölgə düşən yerdə oturmaq, kölgədə gizlənmək. *Gündüzlər istinin dərdindən haman dəliyə girib kölgələnirdi.* C.Məmmədquluzadə. *Göy sərvlər qucağında bir çiçək*

*kimi; Kölgələndi uzaqlarda ağaran liman.* Ə.Cəmil. [Bakıda] *heç kəs istidən kölgələnmək və başını gizlədib işdən qalmaq istəməz.* S.Rəhimov.

3. *məc.* Üzündə qəm, kədər, qüssə əlaməti zahir olmaq; qəmlənmək, qüssələnmək, kədərlənmək (adətən, "gözləri", "üz-gözü", "çöhrəsi" sözləri ilə). *Üzü-gözü kölgələnmək. – Sevilin gözləri güldüyü yerdə; Birdən buludlanıb kölgələndimi?* M.Müşfiq. *Məzlumun çöhrəsi kölgələndi, bir an nə deyəcəyini bilmədi.* S.Vəliyev.

4. *məc.* Qaçıb gizlənmək, birinin himayəsinə, qanadı altına sığınmaq, birinə pənah aparmaq.

**KÖLGƏLƏYİCİ** *sif.* və *is.* Kölgə salmaq üçün istifadə olunan; kölgələndirən.

**KÖLGƏLİ** *sif.* 1. Kölgə salan, kölgəsi olan. *Kölgəli qarağac. Kölgəli ağac. – Eldar ətrafa yaxşı bələd olduğundan, yaxında iri, sərin kölgəli bir söyüd ağacını göstərərək: – Gedək, bir az dincələk, – dedi.* M.Rzaquluzadə. *Odlu mizrabına qurban olum, yar! Çal, səni dinləyir kölgəli dağlar.* N.Rəfibəyli.

2. Kölgə düşmüş, kölgə altında olan; kölgə. *Kölgəli yer. Kölgəli eyvan. – Kölgəli gen küçə ilə bir qədər gedəndən sonra hambal girdi birinci mehmanxananın dalanına.* C.Məmmədquluzadə. *Doldu şirin səslərlə; Kölgəli bağ, boz güney.* Ə.Cavad.

3. *məc.* Şübhəli, qaranlıq. *Yarməmməd kölgəli keçmişdən uzaqlaşa bilməyən adamlardan idi.* M.İbrahimov.

4. *məc.* Qəm, kədər ifadə edən; məyus, kədərli, qəmli, qəmgin. *Kölgəli üz.*

**KÖLGƏLİK** *is.* 1. Kölgə düşmüş yer, kölgə olan yer; kölgə, kölgəli yer. *Kölgəlikdə oturmaq. Kölgəlikdə yatmaq. – Gorus dağının qaşında Nəbini isti vurur, bir kölgəlik tapıb uzanır.* "Qaçaq Nəbi". *Məxməri ormanlarda çiçək dərdiyin yerdə; Baxarsan, çiçəklər var, açar kölgəliklərdə.* Ə.Cavad. *İnsan ayağı dəyməyən bu yerlərdə gündüzlər özünü kölgəliyə verən at, eşşək ağnamış, künclərdə toyuq-cücə eşələnib torpağı atım-atım eləmişdi.* İ.Hüseynov.

2. Kölgə üçün düzəldilən hər şey. *Kölgəlik düzəltmək. // sif. mənasında.* Kölgə üçün olan, kölgə salmaq üçün əkilən. *Qoca kişi kölgəlik ağacın dibindəki çarpayını göstərdi..* S.Rəhimov. // Talvar, alaçıq, dəyə və s. *Kölgəlik düzəltmək.*

3. B a x **günlük** 3-cü mənada. *Ramazan şapkasının kölgəliyini qaldırdı, ətrafa baxa-baxa müdirin otağını tapdı.* Mir Cəlal.

**KÖLGƏSEVƏN** *sif.* Kölgəlik yerlərdə yaxşı bitən, günəş sevməyən. *Kölgəsevən bitkilər.*

**KÖLGƏSİZ** *sif.* Kölgə salmayan, kölgəsi olmayan. *Kölgəsiz ağac.*

**KÖLGƏSİZLİK** *is.* Kölgə salmama, kölgəsi olmama, kölgəsiz yerin, ağacın və s.-nin xüsusiyyəti.

**KÖMBƏ** 1. *sif.* İri, girdə, qalın çörək; qalac. *Qoca qarağacın köhnə qabığı quru kömbə çörəyə oxşayırdı..* Mir Cəlal. [Aslan:] *Düşərgədə hər beş adama gündə bir kömbə köhnə .. çörək verirdilər.* S.Vəliyev.

2. *is.* Küt getmiş xəmirdən kül üzərində bişmiş çörək. *Gördüyün küllü kömbədir, bazara çıxıb, qoğal olub.* (Ata. sözü).

3. *sif.* Yöndəmsiz, kök, gonbul. *Kömbə arvad. – Ocaqverdi kömbə əlini uzatdı.* Çəmənzəminli.

**KÖMBƏÇİ** *is. köhn.* Kömbə bişirib satan adam (b a x **kömbə** 1-ci mənada); çörəkçi. *Dəyirmançının şahidi kömbəçi olar.* (Ata. sözü).

**KÖMBƏDODAĞ** *sif.* Dodağı kömbə kimi, yöndəmsiz, qalın. *Kömbədodaq adam.*

**KÖMƏC**[1] *is. dan.* Boy atmayıb torpağın üzünə yayılan bitki.

**KÖMƏC**[2] *is.* Arı pətəyi. ☐ **Köməc balı** – təmizlənməmiş bal.

**KÖMƏCLƏNMƏ** "Köməclənmək"dən *f.is.*

**KÖMƏCLƏNMƏK** *f.* Köməc bitkisi kimi yerin üzünə yayılmaq. *Taxıl köməclənmişdir.*

**KÖMƏK** *is.* 1. Birinin qarşılaşdığı çətinlikləri, sıxıntıları yüngülləşdirmək üçün görülən iş, hərəkət; yardım. *Lay-lay əməyim bala; Duzum, çörəyim bala; Gözləyirəm böyü sən; Görüm köməyin bala.* (Bayatı). *Bir səs dedi: – Ey qafil; Hər meyvə olur hasil; Zəhmətlə, köməklərlə.* A.Şaiq. [Yaralı] *canını dişinə tutub durmaq, şəfqət bacısının köməyi ilə arxaya getmək istədi.* Ə.Vəliyev. ☐ **Kömək diləmək (istəmək)** – başqasından yardım istəmək, başqasının yardımına ehtiyacı olmaq.

*Atasından kömək diləmək.* – [Rüstəm:] *Atam ölmüş, daha bir kəsdən kömək diləməyə gümanım gəlmir.* C.Cabbarlı. [Gülyazın] *gözü qabağında kömək diləyən məsum bir körpənin siması gəlib durdu.* Q.İlkin. [Aynanın] *sanki kömək istəyən əlləri bir an havada asılı qalıb tappıltı ilə yanına düşdü.* İ.Hüseynov. **Kömək etmək (eləmək)** – yardım etmək, yardım göstərmək. *Yoldaşına kömək etmək. Geridə qalanlara kömək etmək.* – [Şah:] *Mən bir keçə qayırım, bunlar da mənə kömək etsinlər.* Ü.Hacıbəyov. **Kömək görmək** – başqasının köməyi dəymək, yardımı olmaq. [Bəhram:] *Səndən ki, görmədim kömək; Özüm həll eləyəm gərək!* A.Şaiq. **Köməyi dəymək (çatmaq)** – bax **kömək etmək (eləmək)**. *Birinə köməyi dəymək. Qonşuya köməyi çatmaq.* – [Məmmədağa:] *Oğlunuz burada oxuyub yazı-pozu biləcəkdir və onun* [Qurbanəliyə] *köməyi dəyər.* N.Nərimanov. *Uşaqlar kiçik olduqlarından bir o qədər köməkləri çatmırdı.* S.S.Axundov. **Köməyi olmaq** – 1) bax **köməyinə çatmaq (qoşmaq, yetişmək)**. [Qərib:] *Əgər mövlam mənə kömək olarsa; Ağlama, sevgilim, yenə gələrəm.* "Aşıq Qərib"; 2) bir şey edə bilmək, təsiri olmaq. [Əcəb xala:] *Gəlsə də nə kimi bir köməyi ola biləcəkdi.* S.Hüseyn. **Köməyinə çatmaq (qoşmaq, yetişmək)** – darda qalan, çətinliyə düşən adama kömək etmək, yardım göstərmək, əlindən tutmaq. *Yoldaşının köməyinə çatmaq. – Daldakı kazaklar yüyürüşüb, zabitin köməyinə çatdılar.* M.Hüseyn. *Ümidim bircə ona idi ki, Qoçaq mənim gəlmədiyimi görüb özü mənim köməyimə yetişər..* M.Rzaquluzadə.

2. O biri hissələri gücləndirmək üçün ayrılan hissələr, əlavə qoşun hissələri. [Qəhrəman:] *Bundan əlavə, komandan bir-iki saata qədər bizə kömək göndərəcəyinə də söz verdi.* H.Nəzərli.

3. *məc.* Arxa, himayəçi, havadar, yardım edən adam. *Oğul atanın köməyidir. – Lap becadı bu sözləri deməyim; Dağılıbdı arxam, ölüb köməyim.* Aşıq Ələsgər. ☐ **Kömək olmaq (çıxmaq)** – birinə arxa, havadar olmaq, birini himayə etmək. *Yoldaşına kömək çıxmaq.* – [Eyvaz Baxşıya:] *Başıma bir iş gəlsə, sən* [Sonaya] *kömək ol.* C.Cabbarlı. *O, yoldaşına kömək çıxaraq, bir atalar sözünü kinayə ilə ortalığa atdı və masqara ilə hırıldadı..* Ə.Sadıq.

**KÖMƏKÇİ** *is.* 1. Bir işdə kömək edən şəxs; yardımçı. *Uşaq anasının köməkçisidir. – ..Mən Tehranda özümə köməkçi tapa bilərəm.* M.S.Ordubadi.

2. Müavin. *Usta köməkçisi. Rejissor köməkçisi. Operator köməkçisi. – İrəvanda da deyirlər vitse-konsulun köməkçisi biletin birinə İran rəiyyətindən düşəndə on manat alır..* C.Məmmədquluzadə. *Qəbul otağında köməkçi ilə* [Mollayevdən] *başqa heç kim yox idi.* M.Hüseyn.

3. *məc.* Yardımçı, əlavə. *Köməkçi sual. Köməkçi sex.*

◊ **Köməkçi nitq hissələri** *qram.* – əsas nitq hissələrinin xüsusiyyətlərinə malik olmayan sözlər (ədatlar, qoşmalar, bağlayıcılar, modal sözlər). **Köməkçi feil** *qram.* – leksik mənası olmayan, başqa sözlərlə birləşib mürəkkəb feil düzəldən feil (məs.: *etmək, eləmək, olmaq* və s.).

**KÖMƏKDAR** *sif.* və *is. köhn.* Köməkçi. *Köməkdar adam.*

**KÖMƏKDARLIQ** *is. köhn.* Kömək göstərmə, kömək etmə. *İlyas Gülüşgəlinə söz verdi ki, .. köməkdarlıq edib Qəhrəmanı Dağüstü şəhərinə oxumağa göndərəcəkdir.* S.Rəhimov.

**KÖMƏKKEŞ** *is.* və *sif. köhn.* Kömək edən, yardım göstərən.

**KÖMƏKKEŞLİK** *is. köhn.* Kömək etmə, yardım etmə, kömək göstərmə. [Nəcəfalı:] *Köməkkeşlik deyil ha! Ağbirçək arvad uşaqdır bəyəm, qolundan yapışasan?* B.Bayramov.

**KÖMƏKLƏŞMƏ** "Köməkləşmək"dən *f.is.*

**KÖMƏKLƏŞMƏK** *qarş.* Əl-ələ verib bir işi görmək, bir işdə bir-birinə kömək etmək. *Cavan ər-arvad .. əl-ələ verib köməkləşirdilər, işlərini qabağa aparırdılar.* E.Sultanov. *Gəlinlər köməkləşib, dolu səhəngləri bir-birinin belinə aşırırdılar.* M.Hüseyn.

**KÖMƏKLİ** *zərf* Birlikdə, köməkləşərək, bir-birinə kömək edərək, bir yerdə. *Qərənfil xala Camal ilə köməkli yükləri düşürməyə başladı.* Ə.Vəliyev.

**KÖMƏKLİK** bax **kömək** 1 və 2-ci mənalarda. *Etiqad et buna, yəqinə inan; İstəməzdim köməklik insandan.* A.Səhhət. *Müqabil*

*köməklik hər zaman mümkündür..* M.S.Ordubadi. ◻ **Köməklik etmək (eləmək)** – b a x **kömək etmək ("kömək"də).** *Geridə qalanlara köməklik etmək.* – [Yusif:] *Yaxşı ki, Qulu mənə köməklik etdi.* N.Nərimanov. **Köməkliyi dəymək** – b a x **köməyi dəymək ("kömək"də).**

**KÖMƏKSİZ** 1. *sif.* Heç bir köməyi olmayan, heç kəsdən kömək görməyən; aciz. *C.Məmmədquluzadə Novruzəlilərin ürək dağlayan yazıq, ağır və köməksiz həyatlarını çox təbii və inandırıcı təsvir edir.* M.İbrahimov. // Tək, kimsəsiz, adamsız, himayəsiz. *Köməksiz yetim. Köməksiz qadın.* – [Qara:] *Sağ ol, Bəhram, Allah səni mənə çox görməyib, məni köməksiz qoymasın.* C.Cabbarlı. *İndi Qumru kənddə yalnız və köməksiz idi.* Mir Cəlal.

2. *zərf* Heç bir kömək olmadan, heç kəsin köməyi olmadan. *İşi köməksiz görmək.*

**KÖMƏKSİZLİK** *is.* Köməksiz adamın halı və vəziyyəti. *Gəncliyini də, qocalığını da həqiqi bir qürurla yaşayıb köməksizliyin nə olduğunu bilməmişdi.* M.Hüseyn.

**KÖMLƏK** *köhn.* b a x **köynək.** *Ərəqçini, kömləyi, corabı bəy özü geyir.* R.Əfəndiyev. [Rizvan] *yandan düymələnən nazik qara kömləyini geydi.* S.Rəhimov.

**KÖMÜR** *is.* 1. Odunu yandırıb basdırmaqla alınan tünd-qara rəngli bərk yanacaq. *Kürəyə kömür qoymaq. Manqala kömür tökmək. Kömürü qızartmaq.* – [Rüstəm kişi] *..samovara su tökməyə, kömür salmağa ərindi.* M.İbrahimov. *Arvad samovarı çölə çıxartdı. Külünü boşaldıb yaxaladı. Su töküb kömür saldı.* Ə.Vəliyev. ◻ **Kömür basmaq** – kömür almaq üçün odunu yandırıb torpaqda basdırmaq. **Kömür dəymək** – dəm tutmaq, kömürün dəmi (qazı) ilə zəhərlənmək. **Kömür kimi (qədər)** – tünd-qara, zil qara, qapqara. *Kömür kimi uşaq.* – *Açıqlıqdan keçdi, kömür qədər qara .. görünən qamışlığa girdi.* H.Nəzərli. *Onun rəngi kömür kimi qaradı.* M.Hüseyn. **Kömür kimi qaralmaq** – 1) bərk qaralmaq, qapqara olmaq. *Qız yayda kömür kimi qaraldı;* 2) *məc.* hirsindən üzünün rəngi dəyişib tündləşmək. *Rüstəm kişi .. kömür kimi qaralıb susurdu..* M.İbrahimov.

2. Yer altından çıxarılan bitki mənşəli bərk yanacaq, maddə. *Daş kömür. Kömür yataqları. Kömür mədəni. İki vaqon kömür.* – *Donbas bizə kömür verir..* M.Müşfiq. *Fəhlələr qatı kömür tozu içində işləyirdilər.* M.Rzaquluzadə.

**KÖMÜRBASAN** *is.* Kömür basmaqla, yandırmaqla məşğul olan adam (b a x **kömür** 1-ci mənada).

**KÖMÜRÇIXARAN** *sif.* Daş kömür şaxtasında kömür çıxarmaqla məşğul olan (fəhlə və s.). // *is.* Daş kömür çıxarmaqla məşğul olan fəhlə; qazmaçı, şaxtaçı. *Kömürçıxaranların yarışı.*

**KÖMÜRÇÜ** *is.* 1. Kömür hazırlayıb satan adam. *Kömürçünün üzüqaralıqdan nə arı?* (Ata. sözü). [Xortdan:] *Hər baqqalı, dəmirçini, kömürçünü, arabaçını .. dindirirsən, deyir: – Mənim familiyam Kəkilbəyovdur.* Ə.Haqverdiyev. [Ağsaqqal kişi:] *O da kömürçüdür, a kirvə! Bir yük kömür satmağa getmişdi.* Mir Cəlal.

2. Kömür satılan yer, dükan. *Kömürçü dükanı.*

3. Daş kömür sənayesi işçisi; şaxtaçı. *Kömürçülər mükafat aldılar.*

**KÖMÜRÇÜLÜK** *is.* Kömürçünün işi, peşəsi (b a x **kömür** 1-ci mənada). *Kömürçülük eləmək.* – *Cəfərin atası kömürçülükdə qazandığı pulun tən yarısını hər ay müntəzəm halda oğluna göndərmiş, onu oxutmuşdu.* Ə.Vəliyev.

**KÖMÜRDOĞRAYAN** *is. xüs.* Daş kömürü doğrayıb xırdalayan maşın. *Kömürdoğrayanı təmir etmək.* // Sif. mənasında. *Kömürdoğrayan maşın.*

**KÖMÜRXANA** *is.* 1. Kömür basdırılan yer (b a x **kömür** 1-ci mənada).

2. B a x **kömürlük.**

**KÖMÜRXIRDALAYAN** b a x **kömürdoğrayan.**

**KÖMÜRQABI** *is.* Kömür yığmaq, saxlamaq üçün qab.

**KÖMÜRQAZIYAN** b a x **kömürçıxaran.**

**KÖMÜRLƏNMƏ** "Kömürlənmək"dən *f.is.*

**KÖMÜRLƏNMƏK** b a x **kömürləşmək.**

**KÖMÜRLƏŞDİRİLMƏ** "Kömürləşdirilmək"dən. *f.is.*

**KÖMÜRLƏŞDİRİLMƏK** *məch.* Kömür halına saldırmaq, yandırılıb kömür edilmək.

**KÖMÜRLƏŞDİRMƏ** "Kömürləşdirmək"-dən *f.is.*

**KÖMÜRLƏŞDİRMƏK** *icb.* Kömür halına salınmaq, yandırıb kömür etmək.

**KÖMÜRLƏŞMƏ** "Kömürləşmək"dən *f.is.*

**KÖMÜRLƏŞMƏK** *f.* 1. Kömürə dönmək, kömür halına düşmək.

2. Yandıqdan sonra kömürə çevrilmək. *Köz kömürləşdi.*

**KÖMÜRLÜ** *sif.* Üzərinə kömür tozu qonmuş, kömürü olan. *Kömürlü əllər. Kömürlü paltar.*

**KÖMÜRLÜK** *is.* Evlərdə kömür tökülən (saxlanan) yer, kömür anbarı. *Az qalırdı adamlar* [Qədiri] *taxtapuşun altına, kömürlüyə yıxsınlar.* Mir Cəlal.

**KÖMÜRSORAN** *sif. tex.* Hidravlik üsulla kömür çıxarılmasında işlədilən (maşın və s.). *Kömürsoran maşın. // is.* Hidravlik üsulla kömür çıxarılmasında işlədilən maşın və s. *Yeni markalı kömürsoran.*

**KÖMÜRTƏMİZLƏYƏN** *sif.* Kömürü təmizləmək üçün işlədilən. *Kömürtəmizləyən maşını işə salmaq. // is.* Kömürü təmizləmək üçün maşın və s. *Kömürtəmizləyəni quraşdırmaq.*

**KÖMÜRYANDIRAN** b a x **kömürbasan.**

**KÖMÜRYÜKLƏYƏN** *sif. xüs.* Kömürü vaqona, avtomaşına və s. yükləyən (maşın və s). *Kömüryükləyən transportyor. // is.* Kömürü vaqona, avtomaşına və s.-yə yükləyən maşın və s. *Kömüryükləyəni qaydaya salmaq.*

**KÖNDƏLƏN** *sif.* Eninə. *Köndələn xətt. Köndələn tikiş. – Qarşımda başdan-başa; Əyri, köndələn cızıq; Varaq-varaq kağızlar.* R.Rza. *Pərinin üzündə, gözünün altında, boynunda bir köndələn qırış belə nəzərə çarpmırdı.* Ə.Vəliyev. // *zərf* Yanakı, çəpinə, yan. *Atı köndələn sürmək. Köndələn tikmək. Parçanı köndələn kəsmək. – Kor, atı minib köndələn çapar.* (Ata. sözü). [Əhməd] *yavaş-yavaş eşşəyin başını döndərib yolda köndələn oturdu.* B.Talıblı. *Arabaçı isə onlara baxmadan, üzünü köndələn tutub, eyni şikayətli səslə davam etdi..* M.Hüseyn. // Eyni mənada: **köndələninə** şəklində. *Köndələninə oturmaq.* – [Veys] *..divara yanaşı üç cızıq, köndələninə yanaşı iki cızıq çəkdi..* Ə.Əbülhəsən.

**KÖNLÜAÇIQ** *sif.* Şən, gülərüzlü, şad, xürrəm. *Könlüaçıq adam.*

**KÖNLÜAÇIQLIQ** *is.* Şənlik, şadlıq, gülərüzlülük.

**KÖNLÜQARA** b a x **qəlbiqara.** *Çox gözləri yolda qoydun intizar; Şirinzəban, könlüqara, danışma!* Aşıq Hüseyn.

**KÖNLÜQARALIQ** b a x **qəlbiqaralıq.**

**KÖNLÜQIRIQ, KÖNLÜSINIQ** *sif.* və *zərf* Könlü bir şeydən sınmış, incimiş; incik, küskün, ürəyi sınmış. *Könlüqırıq* (*könlüsınıq*) *qız. Könlüsınıq getmək. – Gəldi qabağə qolu bağlı pişik; Könlüsınıq, sinəsi dağlı pişik.* S.Ə.Şirvani. *Molla Əkbər də lal-mat və könlüsınıq evinə qayıtdı.* B.Talıblı.

**KÖNTÖY** *sif.* 1. Kobud, münasibətsiz, ədəbsiz, nəzakətsiz. *Köntöy söz. Köntöy hərəkət. – Siz bunun sözündən inciməyin. Bu həm avam, həm də köntöy adamdır.* Ə.Abasov. // Zərf mənasında. *Köntöy danışmaq. – Tahir həmin dostuna çox acıqlı və köntöy cavab vermişdi.* M.Hüseyn. *Bu vəziyyət belə Rüstəm kişini ayıltmadı, fikrindən döndərmədi, əksinə, onu daha da acıqlandırdı, köntöy tərpənməyə məcbur etdi.* M.İbrahimov.

2. Qaba, kobud, yöndəmsiz, biçimsiz. *Köntöy yaba. Köntöy balta. – Əvvəlcə Qaçay köntöy bir kürək qayırdı.* Ə.Vəliyev.

**köntöy-köntöy** *zərf* Kobud-kobud, qabacasına, kobudcasına, tərs-tərs. *Şahmar köntöy-köntöy cavab verdi.* B.Bayramov. *Nəyinə fikir verəcəyəm? – deyə arvad köntöy-köntöy səsləndi.* İ.Hüseynov.

**KÖNTÖYLÜK** *is.* Kobudluq, qabalıq; ədəbsizlik, nəzakətsizlik. *Köntöylük eləmək.*

**KÖNÜL** *is. şair.* 1. Qəlb, ürək (mənəvi mənada). *Könlümün sevgili məhbubu mənim; Vətənimdir, vətənimdir, vətənim.* A.Səhhət. [Ağarəsul] *..işi yubatmayıb həmin saat könlündəki məhəbbəti qıza söylədi...* E.Sultanov. // *məc.* Obrazlı təşbehlərdə, tərkiblərdə işlənir. *Könül aşnası. Könül mülkü. Dəli könül.* – [Qərib:] *Qıya baxıb, könül evin yıxansan; Tanımırsan solu-sağı, Ağcaqız!* "Aşıq Qərib". *Könül şəhri gündən-günə talandı; İmdi oldu bir xərabə çöllər, hey!* M.V.Vidadi. *Aralıqdan könül quşun ürkütdük; Bir-birilə qonuşmadıq, ayrıldıq.* M.P.Vaqif.

2. İstək, arzu, həvəs, meyil. *Teatra getməyə könlüm yoxdur. Öz könlü ilə.* – [Nigar:]

..*Qonşu arvadların sözünə görə qızın könlü Yusifdədir.* N.Nərimanov.

◊ **Könlü açılmaq** – qəm-qüssəsi dağılmaq, şadlanmaq; ürəyi açılmaq. *Nə könlüm açılar, nə üzüm gülər; Səkrəqibə məhrəm olandan bəri.* Q.Zakir. [Nazlı:] ..*Azacıq gedib gəz də, könlün açılsın.* H.Cavid. *Camaatın könlü yaxşı açılsın; Razıyıq, – dedilər, – sazəndə çalsın!* H.K.Sanılı. **Könlü bulanmaq** – kefi pozulmaq, nəşəsi dağılmaq, qanı qaralmaq. *Könlüm bulanır küçədə cövlanını görcək; Nitqim tutulur hərzəvü-hədyanını görcək.* M.Ə.Sabir. **Könlü çəkmək** – ürəyi çəkmək, iyrənməyib istəmək. **Könlü xoş olmaq** – məmnun olmaq, xoşnud olmaq. **Könlü istəmək** – arzu etmək, xoşlamaq istəmək. *Elə mənim də sizi könlüm istəyir.* M.S.Ordubadi. *Əmiraslan hər bir əmr və göstərişdən azad idi. Hər nə könlü istəsəydi, onu edərdi.* S.S.Axundov. **Könlü qalmaq (incimək)** – xatiri sınmaq, incimək. **Könlü olmaq** – 1) istəmək, meyli olmaq, həvəsi olmaq. *Gəz dolan, bağdan ara; Bülbülü bağdan ara; Bağbanın könlü olsa; Nə gəlib bağda nara?* (Bayatı); 2) razı olmaq. **Könlü olmamaq** – istəməmək, ürəyi olmamaq. [Gülçöhrə:] *Ay ata, vallah, ərə getməyə heç könlüm yoxdur. Necə eləyim?* Ü.Hacıbəyov. [Hacı Murad:] *Məhərrəm bəydə könlün yoxdur, bəs İmranda necə?* S.S.Axundov. **Könlü pozulmaq** – b a x **könlü bulanmaq. Könlü tutulmaq** – qəmgin olmaq, qüssələnmək, tutulmaq. *Gördü nazik ayağın ol dilxun; Tutulub könlü oldu çox məhzun.* S.Ə.Şirvani. **Könlü yaralı** – fəlakət üz vermiş, ürəyində dərdi olan, kədərli. **Könlündən çıxartmaq** – unutmaq, unudub yada salmamaq. **Könlündən keçmək** – ürəyindən keçmək, ürəyində arzu etmək, istəmək. *Onun könlündən çox şeylər keçir.* **Könlünə dəymək (toxunmaq)** – xətrinə dəymək, ürəyinə toxunmaq, qəlbinə dəymək, incitmək, küsdürmək. *Ey gözüm, nə dəyib köyrək könlünə; Ey şirin güftarım, nöşün ağladın?* M.P.Vaqif. *Ey dilim, lal olasan, bilməyirəm kim, nə dedin; Aşina könlünə dəydin ki, olub biganə.* S.Ə.Şirvani. *Ancaq mən Eldarın könlünə dəyməmək üçün daha tüfəngə əl atmadım.* M.Rzaquluzadə. **Könlünə düşmək** – (birdən) arzulamaq, istəmək, ürəyi istəmək. *Axırda elçi quş əti yeməkdən yorulur. Könlünə mal əti düşür.* "M.N.lətif." *Könlümə düşmüş idi bir neçə bütlər həvəsi; Bir zaman beyti-xuda dəhrdə bütxanə idi.* S.Ə.Şirvani. [Kişi:] *Əgər sənin və həkimin könlünə ət düşübsə, mən sizə qoyun verrəm.* M.Dilbazi. **Könlünə görə** – öz arzusu ilə, öz xoşu ilə. **Könlünə yatmaq** – ürəyinə yatmaq, xoşuna gəlmək, qəlbinə yatmaq, bəyənmək. **Könlünü açmaq** – 1) sevindirmək, şadlandırmaq, ürəyini açmaq. *Hər gün açır könlümü zövqi-visalın yengidən; Gərçi güllər açmağa hər ildə bir novruz olur.* Füzuli; 2) birisinə inanaraq ürəyindəkiləri açıb söyləmək, sirlərini açıb demək. **Könlünü almaq** – xoş (şirin) sözlə dilə tutub razı, yaxud təskin etmək, acığını unutdurmaq; qəlbini ələ almaq. *Vaqif deyir, yalvar yara, könlün al; Bir busə diləyib, boynuna qol sal..* M.P.Vaqif. [Mələk Şeydaya:] *Mən səni sıxmaq üçün deyil, yalnız könlünü almaq, acılarını unutdurmaq üçün gəldim.* H.Cavid. [Səfər bəy:] ..*Xərc çəkmişəm ki, birtəhər Molla Abuşun ağzını yumum, məhkəmə rəisinin könlünü alım..* B.Talıblı. **Könlünü ələ almaq (ovlamaq)** – ürəyini ələ gətirmək, razı etmək, məhəbbətini qazanmaq, qəlbini ovlamaq. *Bir ayaq ilə mənim könlümü aldın ələ sən; Görüm, ey saqiyi-gülçöhrə əlin var olsun!* S.Ə.Şirvani. *Ancaq onu da de görüm, onun könlünü ələ gətirmək mümkündürmü?* E.Sultanov. **Könlünü xoş eləmək** – birinin arzusunu yerinə yetirərək sevindirmək. **Könlünü qırmaq (incitmək)** – b a x **könlünə dəymək**. [Turxan bəy Çingiz bəyə:] *Yazıq deyilmi! ..Neçin könlünü qırdın?* H.Cavid. **Könlünü parçalamaq** – b a x **könlünü qırmaq.** *İncə bir riqqət Rübabənin könlünü parçaladı.* Mir Cəlal. **Könlünü sındırmaq** – b a x **könlünü qırmaq**. *Əsli qızların könlünü sındırmaq istəmirdi.* "Əsli və Kərəm". [Xala:] *Yaxşı deyil, ay bala, uşaqlıq eləmə, get, könlünü sındırma!* Ə.Məmmədxanlı. **Könül açıqlığı** – şadlıq, fərəh, sevinc. [Cəmil bəy:] *Doğrusu, könül açıqlığı olmayınca insandakı nəşə də alt-üst olur.* H.Cavid. **Könül bağlamaq** – b a x **könül vermək**. **Könül bulandıran** – ürək-bulandırıcı, xoşa gəlməyən, arzu edilməyən. *Könül bulandıran qəmgin bir axşam; Səlim bəy tutmamış*

*evində aram.* M.Rahim. **Könül bulandırmaq** – kədərləndirmək, qüssələndirmək, qanını qaraltmaq. **Könül qırmaq (yıxmaq, sındırmaq)** – ürək sındırmaq, özündən küsdürmək, özündən incitmək, incik salmaq. *Sən də, gözüm, Allaha baxıb, zülmü az eylə; Peyvəstə könül yıxsan əgər, bir də saz eylə.* M.P.Vaqif. **Könül oxşamaq** – 1) əzizləmək, xoş sözlər söyləmək; 2) xoşa gəlmək, ruhu oxşamaq, ürəyə yatmaq. *İlıq, könül oxşayan meh əsirdi.* Ə.Vəliyev. *Könül oxşayar yaşıl kölgəniz.* M.Seyidzadə. **Könül vermək (bağlamaq)** – 1) aşiq olmaq, ürəkdən sevmək. *Könül verdin hər bivəfa yadlara; Hayıf oldu, ömür getdi badlara.* M.V.Vidadi. *Dostun vəfasını gördüm; Sevdim, seçdim, könül verdim..* Aşıq Ələsgər. *Səni vəfalı bilib eşqinə könül verdim; Pəriliqalara olmazmış etibar, ey dost!* S.Ə.Şirvani; 2) razılıq vermək, razılaşmaq, razı olmaq. *Mən bu işə könül vermədim.* **İki könül bir olmaq** – sevişmək, bir-birini sevmək. *İki könül bir olsa, tez tapar dalda yeri.* (Ata. sözü). **Könül yoldaşı** – yaxın dost, səmimi dost, həmdəm, sirdaş, qəlb yoldaşı.

**KÖNÜLAÇAN** *sif.* Ürəkaçan, xoşagələn, xoş; sevindirici, zövq verən, ləzzət verən. *Könülaçan mahnı. – Qarşıda Xəzər dənizi, Qara və Ağ şəhər zavodları görünürdü. Bu, könülaçan bir mənzərə idi.* S.Hüseyn. [Səriyyə:] *Həyatda hər şey necə gözəl, necə könülaçandır.* İ.Əfəndiyev. *Bəxtəvərlər kəndinin axşamları qarğaşalı olduğu kimi, səhərləri könülaçan, gecələri sözlü-söhbətlidir.* Ə.Vəliyev.

**KÖNÜLLÜ** *sif.* 1. Öz xoşu ilə, öz razılığı ilə, öz istəyi ilə; qeyri-məcburi. *Könüllü vergi. Könüllü əsgər. Könüllü dəstələr. // İs. mənasında.* Bir işi öz xoşu, razılığı, istəyi ilə öhdəsinə götürən adam (adətən orduya könüllü gedənlər haqqında). *Könüllülər batalyonu. – Konsulxananın avtomaşını könüllü yığmaq üçün seçilmiş komisyonun ixtiyarına buraxılmışdı.* M.S.Ordubadi. // Zərf mənasında. [Məmməd:] *Bir çox şəhərləri – Moskvanı və Leninqradı gəzdim, sonra könüllü olaraq Uzaq Şərq ordusuna yazıldım.* C.Cabbarlı. [Aslan:] *Hərbi çağırışı gözləmədən cəbhəyə könüllü gəlmişdi.* S.Vəliyev.

2. ...təbiətli, ...xasiyyətli, ...qəlbli, ...ürəkli (adətən qoşulduğu sözü səciyyələndirir). *Rəssam könüllü. – Deyən, bir insana uydu zavallı; O şair könüllü, rəssam xəyallı.* S.Vurğun.

3. İctimaiyyətin köməyi ilə təşkil olunub işləyən bəzi cəmiyyət adlarının tərkib hissəsi. *Könüllü cəmiyyətlər. Yanğından müdafiə könüllü cəmiyyəti. Orduya, Aviasiyaya, Donanmaya Könüllü Yardım Cəmiyyəti.*

**KÖNÜLLÜLÜK** *is.* Öz razılığı, öz xahişi, öz könlü ilə olma; qeyri-məcburilik. *Könüllülük prinsipi.*

**KÖNÜLSEVƏN** *sif.* Ürəyəyatan, sevimli, xoşagələn, istənilən. *Könülsevən göyçək olar.* (Məsəl).

**KÖNÜLSÜZ** *sif.* və *zərf* İstəmədən, istəməyərək, arzusuz, həvəssiz, ürəksiz, razılığı olmadan, istər-istəməz. *Könülsüz getmək. Könülsüz oxumaq. – Qulu bu dəfə ümidsiz və könülsüz gəldi.* A.Şaiq. *Bibi könülsüz də olsa, qardaş oğlunun sözlərini dinlədi.* Ə.Vəliyev. *Gülpəri çox könülsüz cavab verirdi.* H.Seyidbəyli. □ **Könülsüz tikə** – istənilməyən, arzu edilməyən, ürəyə yatmayan adam, şey haqqında. *..Cəmilə xanımın ərindən zəhləsi gedirdi, onu görəsi gözü yox idi, könülsüz tikə kimi qəbul edirdi.* E.Sultanov.

**KÖNÜLSÜZCƏ** *zərf* Könülsüz, könülsüz halda, könülsüz olaraq; istəməyərək, ürəksizcə. *Könülsüzcə işləmək. Könülsüzcə danışmaq.*

**KÖNÜLSÜZCƏSİNƏ** bax **könülsüzcə.** *Könülsüzcəsinə cavab vermək.*

**KÖNÜLSÜZ-KÖNÜLSÜZ** *zərf* İstəmədən, könlü olmadığı halda, həvəssiz. *Könülsüz-könülsüz cavab vermək. – Gülsənəm arvad könülsüz-könülsüz ayağa qalxdı.* M.Hüseyn. [Dildar] *könülsüz-könülsüz gedib oturdu..* Ə.Vəliyev.

**KÖNÜLSÜZLÜK** *is.* Könlü olmama, ürəyi olmama (istəməmə).

**KÖP** *is.* 1. Şiş, qabarma. □ **Köpünü almaq** – şişini, qabarmasını yatırtmaq. *Ocaqqulu kişi oxlovu qapıb xəşilə batırdı və onun köpünü aldı.* S.Rəhimov.

2. Qarının qazla dolma nəticəsində qabarması, köpməsi. *Uşağın qarnı köpdü.* – [Nümayəndə:] *O yerlərin camaatının rəngi sarı, bədəni zəif, qarınları köplə dolu olur.* Ə.Haqverdiyev.

◊ **Köpü alınmaq (yatmaq)** – zorla sakitləşdirilmək, təşəxxüsdən düşürülmək. *..Cə-*

*bişin köpü alındı. Qəhrəmana da faytonçunun kiriməyi lazım idi.* S.Rəhimov. *Dildarın hirsi xeyli soyumuş, köpü bir az alınmışdı.* Ə.Vəliyev. **Köpünü almaq** – sakitləşdirmək, hirsini soyutmaq, aram etmək. *Bu gün korun köpünü alacaqlar.* M.Hüseyn.

**KÖPBƏCƏ** 1. Bax **koppuş.** *Köpbəcə al.*

2. Bax **köppəcə.** *Köpbəcə bişirmək.*

**KÖPBƏCƏLƏŞMƏ** "Köpbəcələşmək"dən *f.is.*

**KÖPBƏCƏLƏŞMƏK** *f. dan.* Kökəlmək, gonbullaşmaq. *Uşaq nə yaxşı köpbəcələşib?*

**KÖPDÜRMƏ** "Köpdürmək"dən *f.is.*

**KÖPDÜRMƏK** *f.* Üfürmək, ya içini yellə doldurmaq nəticəsində həcmini olduqca böyütmək, şişirtmək.

**KÖPDÜRÜLMƏ** "Köpdürülmək"dən *f.is.*

**KÖPDÜRÜLMƏK** "Köpdürmək"dən *məch.*

**KÖPƏK** *is.* 1. İt. *Vardı Bozlar adında bir köpəyi; Qoyunun pasibanı, həm köməyi.* S.Ə.Şirvani. *..Yaşar yavaşcadan onu adı ilə çağırdı, köpək səsini kəsdi.* M.Rzaquluzadə.

2. Söyüş kimi işlənir. [Yasavulbaşı] *bir gün səhərə yaxın bu xülyalarla yerinin içində xumarlanırkən, birdən qapısı açıldı və qıyıqgözlü, seyrək uzunbığlı sadiq köpəyi başını içəri uzadıb dedi..* M.Rzaquluzadə. ☐ **Köpək kimi** – çox yaltaqlanan adam haqqında. *Köpək kimi xidmət göstərmək.*

◊ **Köpək diş(lər)** – ağzın hər iki tərəfində azı dişlərlə ön dişlər arasında olan diş(lər). *Köpək dişini çıxartmaq.*

**KÖPƏKBALIĞI** *is. zool.* Uzun bədənli, güclü quyruğu olan, iri, yırtıcı dəniz balığı. *..Köpəkbalığının uzunluğu adətən 2-4 metr olur, lakin köpəkbalıqları arasında nəhəngləri də vardır.* "Sualtı aləm".

**KÖPƏKCİK** *is.* "Köpək"dən *oxş. Arxasınca bir köpəkcik zınqıldayıb bağırdı; Sanki bütün yurd xalqını imdadına çağırdı.* A.Şaiq.

**KÖPƏKLƏMƏ** "Köpəkləmək"dən *f.is.*

**KÖPƏKLƏMƏK** bax **köpəkləşmək.**

**KÖPƏKLƏŞMƏ** "Köpəkləşmək"dən *f.is.*

**KÖPƏKLƏŞMƏK** *f. dan.* 1. Qocalmaq, köpək olmaq (erkək it haqqında).

2. *məc. dan. təhq.* Yaşı ötmək, qocalmaq.

**KÖPƏKLİ** *sif.* Köpəyi olan, köpək saxlanan. *Köpəkli həyət. – Köpəkli kənddə əli dəyənəksiz gəzmə!* (Ata. sözü).

**KÖPƏKLİK** *is.* 1. Qoca itin hal və vəziyyəti; qocalıq (erkək it haqqında).

2. *məc. dan. təhq.* Yaşı ötmə, qocalma; qocalıq.

**KÖPƏŞ** *sif.* Şiş, köpmüş. *Köpəş qarın.*

**KÖPƏŞİK** *is.* Dəridə əmələ gələn xırda qırmızı qabarıq; sızaq, sızanaq. *Uşağın qolunda köpəşik əmələ gəlib.*

**KÖPƏŞMƏ** "Köpəşmək"dən *f.is.*

**KÖPƏŞMƏK** *f.* 1. Dəridə xırda, qırmızı qabarıq, sızaq əmələ gəlmək. *Gicitkən daladığından əlləri köpəşib.*

2. Köpmək, şişmək. *Uşağın qarnı köpəşdi.*

**KÖPMƏ** 1. "Köpmək"dən *f.is.*

2. *is.* Şişmə, qabarma, qalxma; köp. *Köpmə xəstəliyi.*

**KÖPMƏK** *f.* 1. Köp əmələ gəlmək; şişmək, qabarmaq, qalxmaq. [Qadının] *solğun üzü köpmüş və göy ləkələrlə örtülmüşdü.* M.İbrahimov. *Torpaq köpmüş, hər yanda böyük-kiçik gölməçələr əmələ gəlmişdi.* H.Seyidbəyli.

2. Gəlmək, acımaq (xəmir haqqında). *Xəmir köpdü.*

3. *dan. zar.* Yatmaq, yatıb qalmaq. *Səhərə qədər köpüb qalıbdır.* – [Qıssa:] *Dağa gedirsən, evini yığışdır apar, getmirsən, yum ağzını, köp yerində.* Mir Cəlal.

**KÖPPƏ** bax **köppəcə.**

**KÖPPƏCƏ** *is. məh.* Yumurta vurulmuş xəmirdən yağda bişirilən çörək.

**KÖPÜK**[1] *is.* Yırğalanan, hərəkət edən maye və ya yarımmaye kütlə üzərində əmələ gələn içərisi hava, ya da qazla dolu girdə qabarcıqlar yığını. *Suyun köpüyü. Dəniz köpüyü. – Köpüklərlə üzə-üzə; Dalğalara qarışdım; Martılarla yarışdım.* A.Şaiq. *Çaylardakı ağ köpük; Yanında bir boz çöpük.* Ə.Cavad. // Süd və s. mayelər qaynadıqda üzərlərində əmələ gələn qabarcıqlar. *Südün köpüyü.* // Sabun və bəzi yuyucu maddələrin suda həll olmasından hasil olan ağrəngli qabarcıqlar. *Sabun köpüyü.* // Ət və s. suda qaynadıqda üzərinə yığılan tullantı hissə; kəf. *Xörəyin köpüyünü yığmaq. Bozbaş köpük eləyib. – Salmanova mürəbbənin köpüyünü alırdı.* Ə.Əbülhəsən.

◊ **Köpük kimi** – qiymətsiz, əhəmiyyətsiz şey haqqında.

**KÖPÜK**$^2$ *dan.* bax **qəpik.** [Səməndər Nərgizə:] *Amma bazara çıxartsan köpük qiyməti yoxdur.* B.Bayramov.

**KÖPÜKCÜK** *is.* Kiçik köpük, incə köpük. *Külək əsdikcə dənizin səthi titrəyir, xırda dalğalarla və ağ köpükcüklərlə dolurdu.* S.Rəhman.

**KÖPÜKLƏMƏ** "Köpükləmək"dən *f.is.*

**KÖPÜKLƏMƏK** *f.* Köpük əmələ gəlmək, köpük etmək. *Su köpükləşmişdi. Çay köpükldi. Yağ köpükldi.*

**KÖPÜKLƏNDİRİCİ** *is. xüs.* Köpükləndirən, köpük əmələ gətirən. *Köpükləndirici maddə.*

**KÖPÜKLƏNDİRİLMƏ** "Köpükləndirilmək"dən *f.is.*

**KÖPÜKLƏNDİRİLMƏK** *məch.* Köpük əmələ gətirilmək.

**KÖPÜKLƏNDİRMƏ** "Köpükləndirmək"-dən *f.is.*

**KÖPÜKLƏNDİRMƏK** *icb.* Köpük əmələ gətirmək. *"Gümrah" barkazı suyu köpükləndirib sıçrada-sıçrada köhnə körpüyə yan aldı.* M.Süleymanov.

**KÖPÜKLƏNMƏ** "Köpüklənmək"dən *f.is.*

**KÖPÜKLƏNMƏK** *qayıd.* 1. Köpük əmələ gəlmək, köpük hasil olmaq, köpüklə örtülmək. *Sabun köpükləndi. Yağ köpükləndi. Pivə köpükləndi. – Göy otların arasından bulaqlar; Şırıltılə köpüklənərkən çağlar.* A.Səhhət. *Şəlalələr qayalardan üzüaşağı gurlayıb axır, köpüklənir.* M.İbrahimov.

2. Çox tərləmək, tər tökmək. *A köhnə yoldaşım! A köhlən atım! Buğlana-buğlana köpüklən, atım!* S.Vurğun.

◊ **Ağzı köpüklənmək** – bax **ağız**$^1$**.**

**KÖPÜKLƏTMƏ** "Köpüklətmək"dən *f.is.*

**KÖPÜKLƏTMƏK** bax **köpükləndirmək.**

**KÖPÜKLÜ** *sif.* Köpüyü olan, köpük verən, köpük edən, köpüklənən, köpüklə örtülü. *Köpüklü su. Köpüklü ləpələr. – Qara dənizin köpüklü dalğaları çınqıllara toxunaraq, qəribə bir musiqi kimi tərənnüm edir.* H.Nəzərli. *Ağ mərmər pilləkənlər köpüklü bir dağ çayı kimi dördüncü mərtəbədən üzüaşağı axırdı.* Ə.Məmmədxanlı. *Ağ köpüklü şəlalələr; Qayaları ovub dələr.* M.Dilbazi.

**KÖPÜKLÜLÜK** *is.* Köpüklü şeyin halı, keyfiyyəti. *Köpüklülük dərəcəsi.*

**KÖPÜKSÜZ** *sif.* Köpüyü olmayan, köpük etməyən, köpük verməyən, ya az verən, az köpük çıxan. *Köpüksüz sabun.*

**KÖPÜRMƏ**$^1$ "Köpürmək$^1$"dən *f.is.*

**KÖPÜRMƏ**$^2$ "Köpürmək$^2$"dən *f.is.*

**KÖPÜRMƏK**$^1$ *f.* 1. Qabarıb köpüklənmək, qabarıb şişmək, kükrəmək. *Dəniz köpürmüşdü. – Yel üfürdü, su köpürdü.* (Ata. sözü). [Nəbi:] *Birlikdə çıxardıq dağa ikimiz; Baxırdıq köpürüb axan sulara.* S.Rüstəm. *Ömür dedikləri coşqun çay kimi; Kükrəyib köpürür, hər zaman gedir.* M.Rahim.

2. *məc.* Bərk hirslənmək, coşmaq, özündən çıxmaq. *Bir anda köpürmüş, bir anda sönmüş; Xırçın əməllərin yadıma düşdü.* M.Müşfiq.

**KÖPÜRMƏK**$^2$ bax **köpmək.** *Relslər yanında torpağın necə köpürüb qalxdığını xatırlayıram.* Ə.Məmmədxanlı.

**KÖPÜRTMƏ** "Köpürtmək"dən *f.is.*

**KÖPÜRTMƏK** bax **köpdürmək.**

**KÖRƏMƏZ** bax **koramaz.** *Soruşdu: – Muştuluq nə verim? Dedim: – Bütün bu adamlara körəməz..* İ.Hüseynov.

**KÖRFƏZ** *is. coğr.* Okeanın, dənizin və ya gölün qurunun içinə soxulmuş hissəsi. *İran körfəzi. Böyük körfəz. Xəzər dənizində bir sıra körfəzlər var. – Bir gün Səlim qamışların arasından körfəzdəki quşlara tamaşa edirdi.* M.Rzaquluzadə.

**KÖRPƏ** *sif.* 1. Südəmər, çağa. *Körpə uşaq. Körpə bala. – Körpə uşaqlar ac və çılpaqlığa davam gətirməyib ağlaşırdılar.* Çəmənzəminli. // Yenicə doğulmuş, bala. *Ağılın ağzında yatan üç körpə quzuya yaxınlaşdı.* M.İbrahimov. // *İs. mənasında.* Südəmər uşaq. *Körpəni sakitləşdirmək. Körpəni yedirtmək. – Körpələr böyüdü, gənclər qocaldı; Zaman yaşa doldu, insan ağıla!..* S.Vurğun. [Şofer:] *Əgər körpələr qabağımı kəsməsəydi, mən də çoxdan dağlarda idim.* S.Vəliyev. *Gəl gedək, dolaşaq dünyanı biz də; Körpənin bu şirin arzusuna bax!* N.Rəfibəyli. ☐ **Körpələr evi** – körpə (üç yaşına kimi) uşaqlar üçün tərbiyə müəssisəsi. *Uşağı körpələr evinə qoymaq. Körpələr evini təmir etmək.*

2. *məc.* Təzə, tər, yeni, sütül. *Körpə xiyar. Körpə budaq. – Çoxdan qurumuş sirkan kollarının, arxların qırağında cücərən körpə otların və yaş torpağın ürəyindən qopan bu*

*ətir Rüstəm kişiyə ləzzət verirdi.* M.İbrahimov. *Mənimdir ətirli, göyçək nağmələr; Mənimdir gülüşlər, körpə budaqlar.* R.Rza. *Qumru üsulluca körpə zoğların dibini eşməyə başladı.* Ə.Məmmədxanlı.

3. Yeniyetmə, lap gənc, uşaq kimi görünən, hələ yetişməmiş. *..Kobud görkəmli Sultan əmi ilə bu zərif körpə gəlini yanaşı görmək lap qəribə olardı.* İ.Hüseynov.

**KÖRPƏCƏ** *sif.* Çox balaca, çox körpə, kiçik. *Alagöz, sarışın, körpəcə bir qız; Dörd divar içində ağlayır yalqız.* S.Vurğun. *Körpəcə ürəyindən silindi böyük yara; Gözlərində ömrünün günəşli sübhü güldü.* S.Rüstəm.

**KÖRPƏCİK** *is.* "Körpə" söz. *oxş. Ah! O körpəciyin nə dərdi vardır? Onu da ağladan bir intizardır.* S.Vurğun.

**KÖRPƏCİYƏZ** "Körpə"dən *oxş.*

**KÖRPƏLİ** *sif.* Körpəsi olan, südəmər uşağı olan; əliuşaqlı. *Körpəli qadın.*

**KÖRPƏLİK** *is.* İnsanın, heyvanın südəmər, süd yeyən dövrü; körpə uşağın, heyvanın hal və keyfiyyəti. // **Körpəlikdən, körpəliyindən** şəklində – lap uşaqlıqdan, kiçik yaşlarından. *Oynamağı körpəlikdən sevmək. Körpəlikdən bir şeyə alışmaq.* – [Əhməd tacirbaşının] *anası onu lap körpəliyindən həmişə xalı-xalça üstündə gəzdiribmiş.* "Koroğlu". // Körpə vaxtında, körpə ikən. *Bülbülün səsi də anasını körpəlikdən itirmiş bir uşağın iniltisi qədər qəmgin və kədərlidir.* M.S.Ordubadi.

**KÖRPÜ**[1] *is.* 1. Çay, dəmir yolu və s. üzərindən keçmək üçün daşdan, taxtadan, dəmirdən qurulan tikili, keçid. *Dəmir yol körpüsü. Taxta körpü. Çay körpüsü. Körpüdən keçmək. Körpü tikmək. – Biz Acı körpüsünü keçib şose yolu idarəsinə çatana qədər iki yerdə vəsiqələrimizi gözdən keçirdilər.* M.S.Ordubadi. ☐ **Asma körpü** – b a x **asma.**

2. Dəniz, çay, göl sahilində gəmilərin yan alması, habelə onların hərəkətini təmin etmək üçün müvafiq tikililəri olan yer. *Körpüdə gəmiyə minmək. Yükü körpüyə boşaltmaq. – Bir qədər yol gedəndən sonra yelkənli qayıq bir körpünün qabağında dayandı.* M.S.Ordubadi. *Cəmil Tahiri gəzinti qayıqları dayanan körpüyə sarı çəkdi.* M.Hüseyn.

3. Tikinti və təmir işlərində ustanın və b.-nın dayanması üçün taxta, şalban və s.-dən düzəldilən qurğu. *Körpü düzəltmək. Körpünün yerini dəyişmək.*

4. *idm.* Güləşmədə və akrobatikada, dabanları və başı yerə dirəyərək, döşün yuxarıya doğru qalxmış vəziyyəti. *Körpü durmaq.*

5. *tex.* Avtomobil və ya traktor şassisinin (çərçivəsinin) oxlar üstündə olan və təkərlərlə bağlı hissəsi. *Dal körpü. Qabaq körpü.*

6. *xüs.* Bir neçə süni dişi birləşdirən lövhəcik.

7. *məc.* Bağlayıcı, əlaqələndirici vasitə mənasında.

◊ **Qıl körpü** – 1) dini əfsanələrə görə, adamların günahkar və ya günahsız olduğunu müəyyənləşdirmək üçün guya qiyamət günü onların üzərindən keçəcəyi qıl kimi nazik körpü. *Qiyamət var, qıl körpü var, qazan var; Rövşən yollarını tar eyləməynən.* Aşıq Ələsgər. [Fərrux Qurbana:] *Cənnət, cəhənnəm, ərəsati-məhşər, qıl körpü haqqında hər axşam hədis söylə.* Ə.Vəliyev; 2) *məc.* çətin sınaq mənasında. *Usta Ağabalanın ürəyi məhbubəsini görmüş aşiq ürəyi kimi döyünürdü. Amma, çifayda oraya getmək mümkün deyildi, arada qıl körpü durmuşdu.* Çəmənzəminli.

**KÖRPÜ**[2] *is.* Bel qayışının ucunu keçirmək üçün, onun üstündə olan halqa.

**KÖRPÜCÜK** *is.* 1. Kiçik körpü, balaca körpü. *Körpücükdən keçmək.* – [Əhmədov:] *Hər dəfə yüz əlli addım o yana, o qədər də bu yana gedincə, buradan bir körpücük tikə bilmərikmi?* Mir Cəlal. *Arxın üstündəki körpücüyə çatanda uşaqlar dayandılar.* Q.İlkin.

2. *anat.* Döş sümüyü ilə kürəyi birləşdirən sümük. // Ümumiyyətlə, bir neçə hissəni, şeyi bir-birinə bağlayan şey.

**KÖRPÜÇÜ** *is.* Körpü tikən adam; körpüsalan. // Körpü mütəxəssisi olan mühəndis. *Körpüçü mühəndis.*

**KÖRPÜLÜ**[1] *sif.* Üzərində körpü olan, körpü salınmış (b a x **körpü**[1] 1 və 2-ci mənalarda). *Körpülü çay. Körpülü dərə.*

**KÖRPÜLÜ**[2] *sif.* Körpüsü olan, ucunda halqası olan (b a x **körpü**[2]).

**KÖRPÜSALAN** b a x **körpüçü.**

**KÖRÜK** *is.* 1. Kürədə odu qızartmaq və s. məqsədlər üçün yanları büküşlü dəri və taxtadan düzəldilmiş alət. *Dəmirçi körüyü.* – [Molla İbrahimxəlil:] *Molla Həmid, çadır-*

*dan tez zərgər kürəsini butası ilə, kiçik körük ilə çıxar, gətir.* M.F.Axundzadə. **Körük basmaq** – bax **körükləmək.** *Çəkici yavaş vurun! Körüyü yavaş basın!* R.Rza. **Körük kimi** – qabararaq, şişərək. *Baş aqronom ayağa qalxanda, qara şevyot şalvarının qalifesi körük kimi şişib boşaldı.* Ə.Vəliyev. *Qocanın sinəsi körük kimi qalxıb endi..* İ.Hüseynov. // Qarmon kimi çalğı alətlərinin havanı sıxan körüyə oxşar hissəsi. [Minayə] *tez-tez başını aşağı salıb qarmonuna, bəzi yeri bir neçə dəfə yırtılıb yamandığına görə hava buraxan körüyünə diqqət edirdi.* Ə.Əbülhəsən.

2. Bax **pərə.** *Bu vaxt Pası burnunun körükləri qalxa-qalxa içəriyə girib qatlanmış kağızı Gülsənəmə uzadaraq: – Dur ayağa! – dedi.* S.Rəhimov.

**KÖRÜKBASAN** bax **körükçü.**

**KÖRÜKÇÜ** *is.* Körük basan, körükdə işləyən (dəmirçi dükanında).

**KÖRÜKÇÜLÜK** *is.* Körükçünün işi, peşəsi.

**KÖRÜKLƏMƏ** "Körükləmək"dən *f.is.*

**KÖRÜKLƏMƏK** *f.* 1. Körük basmaq, körüyü işlətmək. *Qaya körüyün ipini dartıb körükləməyə başladı.* Q.İlkin.

2. *məc.* Daha da qızışdırmaq, şiddətləndirmək, kəskinləşdirmək.

**KÖRÜKLƏNMƏ** "Körüklənmək"dən *f.is.*

**KÖRÜKLƏNMƏK** 1. *məch.* Körüklə hava buraxılmaq, körüklə hava vurulmaq. // *qayıd.* Körüklənmə nəticəsində qızışmaq, qızarmaq. *Kürə körüklənir.*

2. *f.* Qızışmaq, özündən çıxmaq. *Sübhanverdizadə körüklənib .. sözünə davam etdi.* S.Rəhimov.

**KÖRÜKLÜ** *sif.* Körüyü olan, körük qoyulmuş. [Nüşabə:] *Məsturu andıqca, qəlbim odlanır; Elə bil körüklü ocaqdır, yanır.* A.Şaiq.

**KÖSÖV** *is.* 1. Bir hissəsi yanıb qaralmış, yaxud yanıb sönməkdə olan odun parçası. *Kösövləri bir-birinin üstünə yığmaq. Kösövü alışdırmaq. – Keçmiş kösövü zor ilə yerə vuranda qığılcım saçılan kimi* [dərvişin] *gözləri məşəlləndi.* A.Divanbəyoğlu. *Kişinin ovqatı daha da xarablaşar, o yan-bu yanı axtarar, əlinə təndir kösövü götürüb, itə bir-iki çəkərdi.* H.Sarabski. *Xəmiri basdırandan sonra Gülcahan mətbəxin yanındakı təndirə doğru gəlib, təndirin odunu kösövlə qarışdırdı.* T.Ş.Simurq.

2. *məc.* Yanıb qaralmış, kobudlaşmış şey haqqında. [Mürsəl:] *Ayaqların kündə, əllərin kösöv; Gəlin gedən kimi qaynananı döy!* S.Rüstəm. *Rəngi sapsarı, dodaqları göm-göy; Əlləri qapqara bir kösöy.* N.Rəfibəyli. ☐ **Kösövə dönmək** – 1) yanmaq, qaralmaq. *Neçə il qabaq qonşularında olan Pakizə qızın özünü yandırması, bir an içində onun qolqıçlarının bir kösövə dönməsi Nənəqızı dərin bir dəhşətə salırdı.* S.Rəhimov; 2) *məc.* hirslənmək, alışmaq, odlanmaq. [Ədhəm] *fikrinin siyasi təsirini artırmaq üçün bircə an içində qaralıb kösövə döndü.* B.Bayramov.

◊ **Cəhənnəm kösövü** – bax **cəhənnəm. Kösövü tüstülü olmaq** – adı pis çıxmaq, adı vayqanlı olmaq. [Əlyarov:] *Yaxşı, yaxşı, – dedi, – bu sözü burda dedin, başqa yerdə demə, .. onsuz da kösövümüz tüstülüdür.* M.Hüseyn.

**KÖSÖVLƏNMƏ** "Kösövlənmək"dən *f.is.*

**KÖSÖVLƏNMƏK** *f.* Yanıb kösövə dönmək, kösöv olmaq, yanıb qaralmaq. *Odunların yarısı kösövlənmişdi.*

**KÖSÖVLÜ** *sif.* Kösövü olan, əlində kösöv tutmuş. *Evi yanan mənəm, əli kösövlü sən.* (Ata. sözü).

**KÖSTƏBƏK** *is. zool.* Məməlilər sinfindən torpaq altında yaşayan, xırda-gözlü xəzdərili heyvan. *Köstəbək dərisi. Köstəbək xəzi.*

**KÖŞƏ** *is. köhn.* Dəridən, göndən kəsilmiş ensiz bağ. *O, yəhərqaş xurcununda həmişə neştər, biz və burulmuş nazik köşə gəzdirər, yeri gələndə işə salardı.* S.Rəhimov. *İnsan var ki, nə çarıqdır, nə köşə.* R.Rza. ☐ **Köşə çəkmək (çıxartmaq)** – bax **köşələmək** 1-ci mənada.

**KÖŞƏBƏND** *sif. köhn.* Köşə ilə bağlanan. *Köşəbənd çarıq.*

**KÖŞƏK** *is.* Dəvə balası. *Dəvəni itirib köşək axtarır.* (Ata. sözü). *Qoyun, quzu, at, eşşək; Salmış çölə qalmaqal; Dəvə, maya, nər, köşək; Lökləyirlər dalbadal.* A.Səhhət. *Şəfiqənin gözləri köşək gözü kimi iri, qaynar bulaq kimi oynaq və gülərdi.* Ə.Vəliyev.

**KÖŞƏLƏMƏ** "Köşələmək"dən *f.is.*

**KÖŞƏLƏMƏK** *f.* 1. Dəri, gön nə s.-dən köşə kəsmək, köşə çıxartmaq. *Bu gön parçasını köşələmək lazımdır.*

2. Köşə ilə tikmək, köşə ilə bağlamaq. *Axşam namazından, şam yeməyindən sonra*

*əlində çuvalduz çarığını köşələyən Salman kişi ayaq səsi eşitdi.* Mir Cəlal.

**KÖŞƏN** b a x **kövşən.** *Yer deyər: məndədir ol neçə min dağ; Çay, çəmən, bulaq, köşən, bağça, bağ.* Aşıq Məmməd. [Bahar] *Gün yerdən qopana qədər köşəndə gəzdi.* Mir Cəlal.

**KÖŞƏNLİK** b a x **kövşənlik.**

**KÖŞK** *is.* 1. Bağ-bağça içində tikilmiş bəzəkli ev; imarət, qəsr, kaşanə. *Pir Osman küçəsindən gələn dəstə Xərabat məhəlləsinin tinində durub ikimərtəbəli köşkün pəncərəsindən eşidilən musiqi və nəğmələri dinləyir.* M.S.Ordubadi. *Heydərbaba, alçaqların köşk olsun; Bizdən sonra qalanlara eşq olsun!* Şəhriyar.

2. Parklarda, bağlarda istirahət üçün üstüörtülü, yanları açıq yüngül tikili. *Ayaz köşkə yaxınlaşanda, Baxış qabağına çıxdı.* Q.İlkin.

3. B a x **kiosk.** *Qəzet köşkü. Çiçək köşkü.*

**KÖTƏK** *is.* Ağac, dəyənək və s. ilə vurulan zərbə. *Kötək aradakına çox dəyər.* (Ata. sözü). *Şərəf o qədər də aciz deyil ki, Xudayar bəyin sözünün qabağında bir söz danışmasın, yainki ərinin kötəyinin qabağında durub baxsın.* C.Məmmədquluzadə. *Tubu ağlayır, arvad da kötəyin zərbəsindən bağırırdı.* H.Sarabski. ☐ **Kötək altına salmaq** – ağac, dəyənək və s. ilə döymək, kötəkləmək. ..[Kişi] *övrəti beş-on gün salır kötəyin altına, axırda da övrət cana doyandan sonra çıxıb qaçır.* C.Məmmədquluzadə. **Kötək yemək** – b a x **kötəklənmək.** *Hiç məqul söz deməzsən sən! Qandadır kim, kötək yeməzsən sən?* Füzuli. *Qaraca qızın təbiətində inadcıllıq vardı.. Yusifdən nə qədər kötək yeyərdisə də, yenə tərsliyindən əl götürmürdü.* S.S.Axundov. [Məşədi İbad:] *..Arvad ərindən nə qədər kötək yesə, bir o qədər ərin çox sevər.* Ü.Hacıbəyov. **Kötək vurmaq (döşəmək)** – b a x **kötəkləmək.** *Məşədi İmamqulu qeyz ilə uşağı küncdən kənara dartıb, arxasına kötək döşəməyə başladı.* Çəmənzəminli.

**KÖTƏKLƏMƏ** "Kötəkləmək"dən *f.is.*

**KÖTƏKLƏMƏK** *f.* Ağac, dəyənək və s. ilə vurmaq, döymək. *Bir az bir-birimizi cırmaqlayandan və kötəkləyəndən sonra, bir də gördüm ki, bir qoca kişinin qucağındayam.* C.Məmmədquluzadə. [Cəbi:] *Bəlkə yadına salanda səni də kötəkləyə.* S.S.Axundov. *Mahmud hirsindən dodaqlarını çeynəyib öz kişiliyini göstərməyi və arvadı evdə kötəkləməyi qət etdi.* B.Talıblı.

**KÖTƏKLƏNMƏ** "Kötəklənmək"dən *f.is.*

**KÖTƏKLƏNMƏK** *məch.* Ağacla, dəyənəklə vurulmaq; döyülmək. *O ki var kötəkləndi. – ..Bikə tərəfindən hərdənbir kötəklənən* [Asya] *idi.* Ə.Məmmədxanlı.

**KÖTƏKLƏŞMƏ** "Kötəkləşmək"dən *f.is.*

**KÖTƏKLƏŞMƏK** *qarş.* Bir-birini kötəkləmək; vuruşmaq.

**KÖTÜCƏ** b a x **kötükcə** 1-ci mənada. *Nənə öz kötücəsini oynadır.* – [Tahir:] *Sən nəvə nədir, nəticəni də görəcəksən, hələ bir kötücəni də.* M.Hüseyn.

**KÖTÜK** *is.* 1. Ağacın yerdən iri budaqlarına qədər olan hissəsi; oduncaq. *Ağacın kötüyünü kəsmək.* – [Piri-fani:] *O zaman bu qurumuş ağac kötüyü göyərər..* S.S.Axundov. *O gözəlin adını mənim nəzərlərimdə; Qurumuş bir ağacın kötüyünə yazdılar.* S.Rüstəm. *Sinəmdə ürəyim buz bağlayıbdır; Budağı budanmış kötük olmuşam.* B.Vahabzadə.

2. Ağacın qalın yerindən, oduncağından kəsilən bir hissə. *Kötüyün üstündə odun doğramaq. Ət kötüyü* (üstündə ət doğramaq, kəsmək üçün kötük). – *Ocağa böyük kötüklər qoyub yandırdılar.* S.S.Axundov. *Bığı xınalı, dəvərəgöz bir qəssab kötüyün üstündə ət doğrayırdı.* Mir Cəlal.

3. Bir şey işləndikdən sonra qalıb atılan hissəsi. *Siqaret kötüyü. – Yalnız indi başını dik qaldıran Xəlil onun ardınca baxdı, papirosunun kötüyünü yerə çırpıb ayağı altında tapdaladı.* M.Hüseyn. // Qəbz və s. kəsildikdən sonra dəftərçədə qalan hissəsi. *Qəbzin kötüyü. Bloknotun kötüyü.* // Kitabın, dəftərin tikilmiş olduğu yer.

4. *məc.* Yaşlı adam, yaşca ən böyük, qoca, ixtiyar mənasında. *Evin kötüyü. Baba nəslin kötüyüdür.*

5. Kök, rişə. *Ağacın kötüyünü çıxarmaq. Kolun kötüklərini qırmaq.* – [Gilənin] *axşamdan basdırdığı qaratikan kötüyü lülə köz olmuşdu.* Ə.Vəliyev. ☐ **Kötük diş** – sınmış, çürümüş dişin ətin içərisində qalan hissəsi. // *məc*. Əsas, bünövrə, kök. *Etiqad əsl kötükdür, hər əməl şaxəvü bər.* S.Ə.Şirvani.

6. *sif. mənasında.* Kök, şişman, qalın. *Kötük əl. Kötük adam.*

**KÖTÜKCƏ** *is.* 1. Nəticənin uşağı. *Nə nəvən var, nə nəticən, nə kötükcən olacaqdı..* M.Araz.

2. B a x **kötükcük.**

**KÖTÜKCÜK** *is.* Balaca kötük, kiçik kötük.

**KÖTÜKÇIXARDAN** *is. xüs.* Ağac və kolların kötüyünü çıxaran maşın və s. *Yeni markalı kötükçıxardan.* // Sif. mənasında. *Kötükçıxardan maşın.*

**KÖVDƏN** *sif. köhn.* Ağılsız, səfeh, gic. *Lənət olsun bədəsilə, kövdənə; İstəmə, əgərçi can verə sənə.* Q.Zakir. [Vəzir Ağa Bəşirə:] *Sən kövdən, bir mənim evimi, mənim nökərlərimi dolandıra bilmirsən!* M.F.Axundzadə. *Xilqətdə Fəlatun ilə gər mən tən olurdum; Ol arif olub, mən nə üçün kövdən olurdum?* S.Ə.Şirvani.

**KÖVƏR** *is. məh.* b a x **köbər.** [Gülşən] *kövərə bitişik yeri qızlara göstərib dedi..* Ə.Vəliyev.

**KÖVƏŞİMƏ** "Kövəşimək"dən *f.is.*

**KÖVƏŞİMƏK** *f.* Azacıq şişmək, köpmək.

**KÖVKƏB** [*ər.*] *klas.* Ulduz. *Meşəlikdən çıxanda oldu səhər; Sübh işıqlandı, batdı kövkəblər.* A.Səhhət.

**KÖVRƏK** *sif.* 1. Tez ovulan, tez dağılan, tez sınan. *Kövrək kəsək. Kövrək buz. – O zaman qız qaratikan kolunun himayəsinə sığınmış xırdaca çiçəkli boyaqgülünün kövrək zoğlarını gördü.* Ə.Məmmədxanlı. *Rəngini itirmiş kağızın kövrək qat kəsikləri də göstərir ki, xeyli müddət gəzdirilmiş, neçə əldən-ələ keçmişdir.* Q.İlkin.

2. *məc.* Zəif, titrək, nazik, yumşaq, həzin, ağlamsınan. *Qoca, kövrək səsinin titrədiyini duyub susdu.* M.Hüseyn. *Abbas kişi onun bu sözündən kövrək bir ahəng duydu.* Mir Cəlal. *Həsən bəy kövrək və səmimi bir səslə: – Məndən bütün uşaqlara salam yetirin, – dedi.* Q.İlkin.

3. *məc.* Tez təsirlənən, tez mütəəssir olan; ürəyi yuxa, yumşaq. *Kövrək adam. – Bircə kövrək xatirələr qalanmış; Onu da ki, ha çevirim, ha sanım...* M.Araz. ☐ **Kövrək olmaq** – hər şeydən tez təsirlənmək. *Gülnisə son zamanlarda çox kövrək olmuşdu.* M.Hüseyn. *Yaman kövrək olur, yamanca həssas; Yetim ürəklərin eşqi, fitrəti.* B.Vahabzadə.

**KÖVRƏKLƏNMƏ** "Kövrəklənmək"dən *f.is.*

**KÖVRƏKLƏNMƏK** *f.* 1. Kövrək halına gəlmək, tez ovulmaq, tez dağılmaq, tez sınmaq. *Lavaş kövrəklənmişdir. Qar kövrəklənib.*

2. *məc.* Bəzən "ürəyi", "qəlbi", "könlü" sözləri ilə – mütəəssir olmaq, riqqətə gəlmək, tez təsirlənmək, doluxsunmaq, ağlamsınmaq. [Əbülhəsən bəy:] [Qızlar] *məni gördükdə yenə də kövrəklənib ağladılar.* M.S.Ordubadi. *Rüxsarənin ürəyi hərdənbir uşaq ürəyi kimi kövrəklənirdi.* S.Rəhimov.

**KÖVRƏKLƏŞMƏ** "Kövrəkləşmək"dən *f.is.*

**KÖVRƏKLƏŞMƏK** 1. B a x **kövrəklənmək** 1-ci mənada. *Ürək kövrəkləşir sən oxuyanda; Sən də dinləsəydin mən oxuyanda!* M.Müşfiq.

2. B a x **kövrəklənmək** 2-ci mənada. *Sən bu qədər də kövrəkləşmə, Ələmdar, – deyə, Müqim bəy dəsmalını çıxarıb .. Leyləyin gözlərini sildi.* S.Rəhimov.

**KÖVRƏKLİK** *is.* 1. Ovulma, tez dağılma, tez sınma xassəsi. *Çörəyin kövrəkliyi. Buzun kövrəkliyi.*

2. *məc.* Tez təsirlənən, tez mütəəssir olan, riqqətlənən adamın hal və xasiyyəti; tez təsirlənmə, riqqətlənmə, doluxsunma. *Qəribədir, indi Ulduzun səsində elə bir kövrəklik vardır ki, elə bil ki, bu səs bu dəqiqə sınacaq, qırılacaq, dağılacaqdır.* Ə.Məmmədxanlı. *İndi necə oldusa Mədədov qəlbində hiss etdiyi bir kövrəkliklə* (z.) *ondan təkrar soruşdu.* Ə.Əbülhəsən.

**KÖVRƏLMƏ** "Kövrəlmək"dən *f.is.*

**KÖVRƏLMƏK** *f.* 1. Ovulmaq, dağılmaq. *Lavaş kövrəlib.*

2. B a x **kövrəklənmək** 2-ci mənada. [Xavər] *sevincindən kövrəlmiş halda qapını açdı..* M.İbrahimov. *Qoca sanki öz acı istehzasından özü kövrələrək, yaşarmış gözlərini kənara çevirdi.* Ə.Məmmədxanlı. *Arvadın kövrəldiyini görən kişi, Ümidin başına gələn əhvalatı qəti dandı..* B.Bayramov.

◊ **Ürəyi (qəlbi) kövrəlmək** – b a x **kövrəklənmək** 2-ci mənada. [Mahmud:] *Sən ağlayanda mənim də ürəyim kövrəlir, ağlamağım tutur.* Ə.Haqverdiyev. *Bizimlə görüşərkən ürəyi kövrəlib ağladı.* A.Şaiq. *Dodağı*

*nəğməli bu büllur bulaq; Könlümü açmayır, kövrəlir könül.* M.Rahim.

**KÖVRƏLTMƏ** "Kövrəltmək"dən *f.is.*

**KÖVRƏLTMƏK** *icb.* 1. Kövrək hala salmaq, kövrək etmək.

2. *məc.* Tez təsirləndirmək, mütəəssir etmək; riqqətləndirmək, doluxsundurmaq. *Uşağı kövrəltmək. Ağır xəbər qadını kövrəltdi. – Gəlinin sözləri anasını da kövrəltdi.* Çəmənzəminli. [İnci:] *Sən məni kövrəltdin, Gülər.* S.Rəhman. *Qızı təzədən kövrəltməmək üçün Aqil ondan ağlamasının səbəbini də soruşmadı..* Q.İlkin.

◊ **Ürəyini (qəlbini) kövrəltmək** – bax **ürək.** *Məsmə oğlunun ürəyini kövrəltmək istəmədi, daha da təsəlli verdi.* Mir Cəlal. *Hümmətyarın bu cür hərəkət etməsi Xanpərinin qəlbini kövrəltdi.* Ə.Vəliyev.

**KÖVSƏR** *is.* [*ər.*] 1. Dini əfsanəyə görə, guya cənnətdə olan bir bulağın adı. // Şairanə təşbehlərdə. *Ləblərin ləzzəti var; Kövsəririzvandan betər.* Aşıq Ələsgər. ◻ **Kövsər suyu** – bax **abi-kövsər ("ab"da).** *Qədir.. şərabı kövsər suyuna bənzədir.* Mir Cəlal.

2. *məc.* Şirin, dadlı, ləzzətli içki mənasında. *Gözəllər çeşməndən götürmür abı; Dad verə dəhanda kövsər şərabı.* Aşıq Ələsgər.

**KÖVŞƏN** *is.* 1. Taxıl əkilmiş yer; zəmi. *Heç keçilər öz-özünə kövşəndən çıxıb canavara yem olarmı?* S.Rəhimov. [Ataş:] *Atam kövşəndə taxıl biçəndə anam xırmanda vəl sürürdü, sovruq atırdı..* Ə.Vəliyev. // Taxılı biçilmiş tarla. *Dağlarda, daşlarda, kövşənlərdə Alı kişinin ayağı dəyməmiş bir qarış da yer qalmamışdı.* "Koroğlu". *Kəhər kövşənin ortasında, yoldan xeyli aralı uçuq bir xarabalığın səmtinə çatırdı.* M.İbrahimov. *..Taxılı biçilib yığılmış kövşənlər tez-tez bir-birlərini əvəz edirdi.* İ.Əfəndiyev.

2. Küləş. *Kövşən dam. – Yeddi-səkkiz addım kənarda, üstü kövşənlə örtülmüş emalatxananın yoğun dirəyinə söykənib Xəlilin tanımadığı bir kəndli ilə söhbət edən katibini səslədi.* M.Hüseyn.

**KÖVŞƏNLƏMƏ** "Kövşənləmək"dən *f.is.*

**KÖVŞƏNLƏMƏK** *f.* Üstünü kövşənlə, küləşlə örtmək. *Damı kövşənləmək.*

**KÖVŞƏNLƏNMƏ** "Kövşənlənmək"dən *f.is.*

**KÖVŞƏNLƏNMƏK** *məch.* Üstü kövşənlə, küləşlə örtülmək.

**KÖVŞƏNLİ** *sif.* Kövşəni olan, üstü kövşənli örtülmüş. *Kövşənli dam.*

**KÖVŞƏNLİK** *is.* Taxılı biçilmiş tarla. *Kürün o tayından əsən qəfil külək sahildəki biçənəyin üstündən adlayıb kəndin arasını dolaşdıqdan sonra kövşənliyi xışıldatdı, xır yolu tərəfə gəldi və gözlənilmədən yana burulub təpədəki qəbristanlığa doğru döndü.* İ.Şıxlı.

**KÖZ** *is.* Od yandıqdan sonra qalan alovsuz, qızmar kömür. *Ağac yanar, köz olar; Su səpmə, köz-köz olar.* (Bayatı). *Firəngiz göbələklərin çökəyinə duz səpib, bir-bir közün üstünə düzürdü.* B.Bayramov. // *məc.* Qızğın, odlu, hərarətli mənasında. *Əbədi bir heykəl qurur sənətkar öz ürəyində; Bu hörmətdən alov tutar, alışar köz ürəyində.* B.Vahabzadə. ◻ **Köz düşmək** – bax **közə dönmək.** *Tonqalın alovu sönüb köz düşdükcə onun başındakı fədailərin halqası daralır və sıxlaşırdı..* M.İbrahimov. *Ocaq çatıldadıqca qığılcımlar ətrafa sıçraşır, yavaş-yavaş köz düşürdü.* İ.Şıxlı. **Köz salmaq** – yandırmaq, qızdırmaq üçün yanar kömür və ya başqa bir şey salmaq, tökmək. *Aqil qalxıb balaca samovara su tökdü, gətirib köz saldı, onu balkona qoyub qayıtdı.* S.Rəhimov. *Göyçək samovarı balkona qoyub köz saldı.* Ə.Vəliyev. **Közə döndərmək** – 1) qızartmaq, közərtmək. *Odları yandırıb közə döndərmək;* 2) bərk qızdırmaq, qızmar hala salmaq. *Avqust günəşinin qızdırıb közə döndərdiyi hava .. daha da ağırlaşırdı.* Ə.Əbülhəsən. **Közə dönmək** – 1) qızarmaq, közərmək. *Ocaqda kömür közə döndü;* 2) yanıb puç olmaq, istinin şiddətindən tələf olmaq, xarab olmaq. *Məhsul* közə *dönüb. Otlar közə dönmüşdü.* // İstidən, quraqlıqdan yanmaq. *Tiflis və Kars mahalları quraqlıqdan yanıb közə dönüblər.* C.Məmmədquluzadə. **Köz kimi (təki)** *məc.* – qıpqırmızı, alov kimi. *Sifəti köz kimi qızarıb.* – [Koroğlu:] *Sinəm odlandı köz kimi; Miskin olarmı biz kimi?* "Koroğlu". *Qaşlar vəsmələnir, göz sürmələnir; Köztək yanaqları xoş şölələnir.* M.P.Vaqif. // Od kimi. *Ayrılıq dediyin duzlu bir sudur; İçdikcə köz kimi yandıracaqdır.* R.Rza. // *məc. mənada.* Pul haqqında. [Qədir:]

*Ay başa çatmayıb ki, Qumrunun əziz cehizi, alagöz kilimi çərçiyə satılıb pulları köz kimi nağd yüzbaşının ovcuna tökülmədimi?* Mir Cəlal.

**köz-köz: köz-köz olmaq** – köz kimi olmaq, köz kimi işıldamaq. *Dərdin çoxdur, döz, anam; Ürəyi köz-köz anam; Qohum-qardaş dayansın; Qoy ağlasın öz anam.* (Bayatı). *Bağrı köz-köz oldu "Yanıq Kərəm"in; Tellər inildədi, yandı, nə yandı.* B.Vahabzadə.

**KÖZƏL** *is.* Xırman sovrulanda taxılla saman arasında qalan çör-çöp, iri saman, sünbül və s.

**KÖZƏRDİLMƏ** "Közərdilmək"dən *f.is.*

**KÖZƏRDİLMƏK** *məch.* Yandırılıb qızardılmaq.

**KÖZƏRİŞMƏ** "Közərişmək"dən *f.is.*

**KÖZƏRİŞMƏK** *f.* Közərmək, köz kimi işıq vermək, işıldamaq (bir neçə lampa və b. közərən şey haqqında). *Elektrik lampaları közərişirdi.*

**KÖZƏRMƏ** "Közərmək"dən *f.is.*

**KÖZƏRMƏK** *f.* 1. Yanıb qızarmaq, alovsuz yanmaq, qıpqırmızı olmaq. *Samovarın qaynaması zəifləyib, əvvəlki gurultu sakit olmuş, ocağın alovu sönmüşdü, ancaq odlar közərirdi..* H.Nəzərli. *Qoca fikirli bir halda ocaqda közərən oda baxaraq deyirdi..* Ə.Məmmədxanlı.

2. Zəif işıq vermək; işarmaq, işıldamaq, parıldamaq. *Uzaqdan lampa közərirdi. – Tin başında bir fənər közərir.* R.Rza. // Az-az yanmaq, sönmək üzrə olmaq. *Gecə keçir, közərən lampa get-gedə öz işığını azaldırdı.* S.Rəhimov.

3. *məc.* Qızışmaq, canlanmaq.

**KÖZƏRTİ** *is.* Sönməkdə olan közün, lampanın və s.-nin işığı, parıltısı; işartı. *Fənərin közərtisi. Ocaqda közərti görünürdü. – Yol uzunu papiros közərtiləri görünürdü.* S.Rəhimov. *Sahilboyu səpələnmiş kənd evlərinin solğun işıqları, həyətlərdə qalanan ocaqların közərtiləri də yavaş-yavaş söndü.* İ.Şıxlı.

**KÖZƏRTMƏ** "Közərtmək"dən *f.is.*

**KÖZƏRTMƏK** *f.* Kömürü, odu köz halına salmaq: qızartmaq. *Təndirin odunu közərtmək.* – [Sarı] *bir an içində yelpikləyib kömürü közərtdi və samovara od saldı.* S.Rəhimov.

**KÖZLƏMƏ** "Közləmək"dən *f.is.*

**KÖZLƏMƏK** *f.* Köz etmək, köz halına salmaq. *Kömürü közləmək. // məc.* Yandırmaq, yaxmaq.

**KÖZLƏNMƏ** "Közlənmək"dən *f.is.*

**KÖZLƏNMƏK** *qayıd.* Köz halına çevrilmək, közə dönmək.

**KÖY** *is.* [*türk.*] Kənd. *Kürün sahilində var əski bir köy; Üstündə hər zaman çılpaq olur göy.* S.Vurğun.

**KÖYLÜ** *is.* [*türk.*] Kəndli. *Xoca tacir, köylü və sair; Alış-verişlə məşğuldurlar.* H.Cavid. *Amansız müharibə heç bir kəsin torpaq və yurdunda gözü olmayan bu zavallı köylülərin yaşayışını pozmuş, yurdlarını dağıtmış, özlərini də dilənçi halına salmışdı.* T.Ş.Simurq.

**KÖYNƏK** *is.* 1. Bədənin yuxarı hissəsinə geyilən yüngül geyim. *İpək köynək. Miləmil köynək. Köynək tikdirmək. Köynəyini ütüləmək.* – [Qız:] *Keçən il burada student olurdu, həmişə evdə bir köynəkdə oturardı.* Çəmənzəminli. *Nazlı əynindəki tünd şabalıd rəngli .. köynəyini çıxartdı..* S.Rəhman. // *məc.* Libas, paltar mənasında (adətən rəng adları ilə). *Yaşıl köynəyini geyinir meşə; Yaxama quş kimi qonur bənövşə.* S.Vurğun. *Köynəyi al ipək lalə; Zərif, qəşəng, göyçək lalə.* M.Rahim.

2. Musiqi alətlərini və s.-ni qoymaq üçün parçadan və s.-dən tikilmiş torba; çexol. *..Bəlli Əhməd sazı ipək köynəkdən çıxartdı.* "Koroğlu". *Çıxartsın köynəkdən Ələsgər sazı; Genə cuşa gəlsin eşqi, avazı..* Aşıq Ələsgər. [Pərşan:] *İki dəqiqə keçməmiş xüsusi köynək içində saxlanan sazı gətirdi.* M.İbrahimov.

3. *tex.* Örtük, sipər. *..Qoruyucu köynək həncama vasitəsilə birləşdirilmiş oynaqlı iki yarımhissədən ibarətdir.* M.Süleymanov.

4. Baramanın iç qatı. // Buğdanın üstündə olan nazik qabıq.

5. *məh.* Arabanın dəmir oxunun yerləşdiyi ağac hissə.

◊ **Köynək-köynək (bir köynək) ət tökmək** – bərk utanmaq, xəcalət çəkmək, pərt olmaq, xəcil olmaq, xəcalətindən yerə girmək. *Qədir buraxıldısa da, məscid həyətində bir köynək ət tökdü.* Mir Cəlal. [Nəcəfalı:] *Bu gün qolu-qıçı sınanları yığıb şəhərə apardıqlarını eşidəndə köynək-köynək ət tökmü-*

*şəm.* B.Bayramov. **Köynəyinin yaxasından keçirmək** *etnoqr.* – övladlığa götürmək əlaməti olaraq körpə uşağı köynəyinin yaxasından keçirməkdən ibarət köhnədənqalma adət. *Xala, qızı köynəyinin yaxasından keçirib, özünə övlad etmişdi.* B.Bayramov.

**KÖYNƏKCƏK** *zərf* Köynəksiz, əynində köynək olmadığı halda, bədəni açıq. *Bu halda qalmaqaldan Hatəmxan ağa və Şahbaz bəy yatdıqları damdan yuxudan .. köynəkcək Müsyö Jordanın səsinə yüyürürlər.* M.F.Axundzadə. *Başımız qırxılı, ya birçək idi; Biri donsuz, biri köynəkcək idi.* Ə.Vahid. *Səməd döşəmədə, yalxı döşəkağı üzərində köynəkcək uzanmışdı.* İ.Hüseynov.

**KÖYNƏKCİK** *is.* Kiçik köynək, balaca köynək. *Uşaq köynəkciyi.*

**KÖYNƏKLİ** *sif.* Köynək geymiş əynində köynək olan. *Köynəkli adam. İpək köynəkli uşaq. – Döyülən sarı köynəkli gənc bir qadın idi.* S.Hüseyn.

**KÖYNƏKLİK** *sif.* 1. Köynək tikilməyə yarar. *Köynəklik parça.*

2. *is. mənasında.* Köynək tikmək üçün yarayan parça. [Pərzad:] [Oğlum] *bir gün olmaz ki, əliboş gəlsin. Bir gün tumanlıq alır, bir gün köynəklik alır..* N.Nərimanov. [Çimnaz] [Veysə] *köynəklik alıb göndərmişdin ki?* Ə.Əbülhəsən.

3. Saylarla birlikdə işlədilərək bir, iki və s. köynəyə çatacaq parçanın miqdarını bildirir. *İki köynəklik parça. Bir köynəklik ağ.*

**KÖYNƏK-ŞALVAR** *is.* Köynək və şalvardan ibarət üst geyimi komplekti. *Köynək-şalvar tikdirmək. – Sirat xaki köynək şalvarda tərdən islanırdı.* Ə.Əbülhəsən. [Nərimanın] *ayaqlarında uzunboğaz çəkmə, əynində sürməyi yun parçadan köynək-şalvar var idi.* İ.Əfəndiyev.

**KÖYNƏK-TUMAN** *is.* Köynək və tumandan ibarət alt geyim komplekti; dəyişək. *Ağ köynək-tuman. Köynək-tuman almaq. – .. Mən sənə köynək-tuman yumağa gəlmişəm.* Mir Cəlal.

**KRAXMAL** [*alm.*] b a x **nişasta.**

**KRAXMALLAMA** "Kraxmallamaq"dan *f.is.*

**KRAXMALLAMAQ** *f.* Şax olmaq üçün paltarı kraxmallı (nişastalı) suya salmaq. *Paltarı kraxmallamaq.*

**KRAXMALLANMA** "Kraxmallanmaq"-dan *f.is.*

**KRAXMALLANMAQ** *məch.* Şax olmaq üçün kraxmallı (nişastalı) suya salınmaq. *Paltar kraxmallanıb.*

**KRAXMALLI** *sif.* 1. Kraxmal vurulmuş, kraxmalı olan suya salınmış. *Kraxmallı köynək. Kraxmallı döşəkağı. – Direktor kraxmallı parusin pencəyini çıxarıb, tor köynəkdə oturdu.* B.Bayramov.

2. Tərkibində kraxmal (nişasta) olan, kraxmaldan hazırlanmış. *Kraxmallı yapışqan. Kraxmallı su.*

**KRAL** [*rus.*] 1. Bəzi feodal və burjua dövlətlərində: hökmdarların titulu; padşah, habelə həmin titulu daşıyan şəxs. *İsveç kralı. İngiltərə kralı. – Orda hər şey asılı; Qan içən bir kraldan.* Ə.Cavad. [Ağazəki:] *Səlimcan! ..O hansı ölkədi ki, orda cəmi-cümlətani otuz soldat var, onlar da kralın keşiyini çəkirlər?* İ.Məlikzadə.

2. Üzərində başıtaclı kişi şəkli olan, tək xaldan sonra ən böyük kart kağızı; şah.

**KRALİÇA** [*rus.*] 1. Qadın hökmdar (padşah). *1956-cı ildə İngiltərə kraliçasına Qarabağ atı – "Zaman" hədiyyə göndərilmişdi.* B.Vahabzadə. ☐ **Gözəllik kraliçası** – öz gözəlliyi ilə başqaları arasında birinci yer tutan gözəl qadın; gözəllər gözəli.

2. Kral arvadı.

3. Şahmatda: vəzir (ferz).

**KRALLIQ** *is.* 1. Başında kral duran dövlət. [Mister Tomas:] *İranın şimal sərhədlərindəki dövlət quruluşu krallığın nəzərində İranı.. əbədi əndişədə saxlayan bir səbəbdir.* M.İbrahimov.

2. Kral sifəti ilə belə bir dövləti idarəetmə.

**KRAN**[1] [*alm.*] Çən, boru və s.-də maye və ya qazları açıb buraxmaq və qapamaq üçün boru şəklində lüləyi olan cihaz; qurna. *Kranı açmaq* (*bağlamaq*). *Kranı burmaq. – Gurultu dəhşəti, yanğın lərzəsi; Salmışdı heyrətə bu gün hər kəsi; Kranı bağlamaq gərəkdi əvvəl; Bununçun lazımdı bacarıqlı əl.* M.Müşfiq. ..[Qoşqar] *kranın altında gölləndikcə ortasından xırdaca deşik açılıb burulğan kimi burulan suya baxdı və təzədən həvəsə düşüb qurşaqdan yuxarı soyundu.* İ.Hüseynov.

**KRAN**[2] [*holl.*] Yük qaldırmaq və ya endirmək, habelə onu üfüqi vəziyyətdə yaxın məsafəyə aparmaq üçün qaldırıcı maşın. *Körpülü kran. Üzücü kran. Kranı quraşdırmaq.* – [Yusif:] *Camal, axı sən bu təchizat şöbəsindən soruş ki, niyə bir aydır o kranı stansiyadan gətirib çıxarmır?* S.Rəhman. *..Yıxılan evlərə; Qaldırıcı kran; Olmağı bacar!* M.Araz.

**KRANCIQ** *is.* Kiçik kran, balaca kran, qurnacıq (b a x **kran**[1]). *Laboratoriya krancığı. Krancığı açmaq.*

**KRANÇI** *is.* Kranda işləyən, kranı idarə edən işçi (b a x **kran**[2]). *Krançı qız.*

**KRANÇILIQ** *is.* Krançı peşəsi, işi, sənəti. *Krançılıq etmək.*

**KRANLI** *sif.* Kranı olan, qaldırıcı mexanizmi olan (b a x **kran**[2]). *Kranlı maşın. Kranlı arabacıq.*

**KRANT** *dan.* "Kran"ın canlı dildə işlənən yanlış forması. *Nənəqız vedrəni götürüb su krantına tərəf gəlməyə başladı.* S.Rəhimov. *Kürəyə, od püskürən kranta yaxınlaşmaq çətin idi.* Mir Cəlal.

**KRÁTER** [*yun.* krater – kasa] Vulkan zirvəsində: püskürtü zamanı lavanın çıxdığı kasa və ya qıf şəklində çökəklik. *Sönmüş vulkan krateri. – Teleskopla Aya baxanda orada vulkan kraterləri görünür.* M.Qaşqay.

**KREDÍT** [*lat.* creditum] *mal.* 1. Borc olaraq mal və ya pul vermə. *Uzunmüddətli kredit. Qısamüddətli kredit.*

2. Müəyyən məqsəd üçün xərclənməsinə icazə verilmiş məbləğ. *Xüsusi kreditdən maaş vermək. Büdcə krediti.* – [Katib:] *İrandan bizim fabriklər üçün altı min ton pambıq getməlidir. Bu barədə təbdir edib qiymətini və kredit şərtlərini bizə xəbər verməniz xahiş olunur.* Ə.Haqverdiyev.

◊ **Kredit bileti** *köhn.* – kağız pul, əsginas. **Dövlət krediti** *iqt.* – dövlət istiqraz sistemi.

**KRÉDİT** [*lat.*] Mühasibat dəftərində: bir idarə və ya müəssisənin bütün çıxarlarının qeyd edildiyi hesab səhifəsi (adətən sağ səhifə) (*debet* müqabili).

**KREDİTÓR** [*lat.*] Kredit verən şəxs və ya idarə.

**KRÉDO** *is.* [*lat.*] Məslək, əqidə.

**KREKÍNQ** [*ing.* cracking] *tex.* 1. Neftdən, mazutdan daha yüngül məhsullar (benzin, qazolin və s.) almaq üçün xüsusi qurğu. // Benzin və s. məhsullar əldə etmək üçün neftin xüsusi qurğularda işlənməsi.

2. Bu cür emal nəticəsində alınan krekinq qazı.

**KREKİNQLƏMƏ** "Krekinqləmək"dən *f.is.*

**KREKİNQLƏMƏK** *f. xüs.* Daha yüngül məhsullar (benzin, qazolin və s.) almaq üçün ağır neft məhsullarını (mazut və s.-ni) xüsusi qurğularda işləmək.

**KREM** [*fr.*] 1. Şəkərlə çalınmış qaymaq, süd, yağ, yumurta və s.-dən ibarət qatı maddə, mət (şirni kimi, yaxud pirojna, tort və s. üçün işlədilir). *Şokoladlı krem.*

2. Üzə, ələ sürtmək üçün dəri yumşaldıcı kosmetik yağ. *Kremlər yağ halında olur, mürəkkəb tərkiblidir.* // Ayaqqabı yağı. *Çəkmə kremi.*

**KREMÁSİYA** [əsli *lat.*] Meyitlərin xüsusi sobalarda yandırılması; dəfn növlərindən biri.

**KREML** Rus feodal şəhərlərinin bürclü qala divarları ilə əhatələnmiş və möhkəmləndirilmiş hissəsi.

**KREMLİ** *sif.* Kremi olan (b a x **krem** 1-ci mənada). *Kremli pirojna. Kremli tort.*

**KREP** [*fr.*] 1. Səthi nahamar ipək və ya yun parça. *Krepdən paltar tikdirmək.*

2. Yığış-yığış, büzməli qara rəngli nazik parça.

**KREPDEŞİN** [*fr.* crepe de Chine – Çin krepi] Sıx, nazik ipək parça. *3 metr krepdeşin almaq.* // Bu parçadan tikilmiş. *Krepdeşin kofta. Krepdeşin yaylıq.* – [Suğra] *güllü-çiçəkli krepdeşindən lap yeni dəblə tikilmiş uzun bir don, lak tufli geymiş, hətta sırğa da taxmışdı.* M.Hüseyn. *Qaratel sadə çit don geyib, başına ağ krepdeşin örpək örtmüşdü.* Ə.Əbülhəsən.

**KRESLO** [*rus.*] Dirsəklənmək üçün qoltuqluğu olan geniş (adətən yumşaq) stul, kürsü. *Kresloda oturmaq. – Otağın içində stol, kürsü və kreslolar vardır.* Ü.Hacıbəyov. *Məhərrəm yorğun bir halda kresloya sərilib, başını ovcu içinə aldı.* H.Nəzərli. *Stullar, kreslolar, güzgülü divan, xalı; Vaz, şkaf, əlüzyuyan – hamısı da bahalı.* R.Rza.

**KREŞÉNDO** [*ital.*] *mus.* Daha ucadan; səslərin qüvvəsini getdikcə artıraraq.

**KRÉYSER** [*holl.*] Qüvvətli silahları olan çox sürətli hərb gəmisi. *Ağır kreyser. Yüngül kreyser.* □ **Kreyser sürəti** *xüs.* – maksimal sürətdən fərqli olaraq gəmi və ya təyyarənin normal sürəti.

**KRİMİNALİST** [*lat.*] *hüq.* Kriminalistika mütəxəssisi.

**KRİMİNALÍSTİKA** [latıncadan] Cinayəti tədqiq üsullarını öyrənən hüquq elmi.

**KRİMİNOLÓGİYA** [*lat.* crimen – cinayət və *yun.* logos – nəzəriyyə] *hüq.* İctimai bir hadisə kimi cinayət haqqında nəzəriyyə.

**KRİMİNOLÓQ** [latıncadan] *hüq.* Kriminologiya mütəxəssisi.

**KRİSTÁL** [*yun.*] Təbii olaraq hissəcikləri (atomları, ya ionları) geometrik şəkildə birləşmiş bərk cisim; büllur. *Duz kristalı. Almaz kristalı.* // Bu şəkildə olan, kristaldan ibarət olan. *Kristal maddə. Kristal çoxbucaqlı.*

**KRİSTALLAŞDIRILMA** "Kristallaşdırılmaq"dan *f.is.*

**KRİSTALLAŞDIRILMAQ** *məch.* Kristal halına (şəklinə) salınmaq. // Büllurlaşdırılmaq.

**KRİSTALLAŞDIRMA** "Kristallaşdırmaq"-dan *f.is. Kristallaşdırma cihazı.*

**KRİSTALLAŞDIRMAQ** *icb.* Kristal halına (şəklinə) salmaq. // Büllurlaşdırmaq.

**KRİSTALLAŞMA** "Kristallaşmaq"dan *f.is. Kristallaşma zamanı ionlar nə qədər çox enerji itirsələr, bu prosesin nəticəsində əmələ gələn kristal bir o qədər möhkəm olar.* M.Qaşqay.

**KRİSTALLAŞMAQ** *f. xüs.* Kristala çevrilmək, kristal şəklinə düşmək. *Lavanın yer üzərində tez soyuması nəticəsində tərkibinin bir qismi kristallaşır, digər qismi isə xırda kristallik və yaxud şüşəvari olur.* M.Qaşqay. // Büllurlaşmaq.

**KRİSTALLİK** *sif.* [*yun.*] Kristal formasında olan, kristaldan ibarət olan, kristala aid olan. *Kristallik süxurlar.* // Büllur.

**KRİSTALLİZATOR** [*yun.*] *xüs.* Kimyəvi birləşmələri kristallaşdırmaq üçün silindrik, dayaz şüşədən ibarət cihaz.

**KRİSTALLÓQRAF** [*yun.*] Kristalloqrafiya mütəxəssisi, kristalloqrafiya alimi.

**KRİSTALLOQRÁFİYA** [*yun.* krustallos və grapho] Kristallar haqqında elm.

**KRİSTALÓN** *is. xüs. ad.* Parlaq sintetik parça.

**KRİSTALŞƏKİLLİ** *sif.* Kristala oxşayan, kristal formasında olan. *Kristalşəkilli süxur.*

**KRÍŞNA** *is.* Hindlilərdə Vişnu allahın təcəssümlərindən biri.

**KROKÉT** [*ing.*] 1. Şarları taxta çəkiclərlə vurub məftil qapılardan keçirməkdən ibarət oyun. *Kroket oynamaq.* // Bu oyun üçün ləvazimat. // Bu oyun üçün meydança.

**KROKETÇİ** *is.* Kroket oynayan adam.

**KRON** [*alm.*] Bəzi Avropa ölkələrində pul vahidi, habelə həmin dəyərdə olan metal pul. *Çexoslovakiya kronu.*

**KROSS** [*ing.*] Dərə-təpəli yerdə maneələri aşmaqla idman qaçışı, cıdır və s. *Kross yarışı.*

**KROSSVÓRD** [*ing.* cross-word] Müəyyən sözü tapmaq üçün üfüqi və şaquli kvadratlara bölünmüş fiquru hərflərlə doldurmaqdan ibarət oyun; bilməcə. *Krossvord həll etmək.*

**KROVÁT** [*rus.*] b a x **çarpayı.** *İskəndərin evi, küncdə dəmir krovat..* C.Məmmədquluzadə. *Mən krovatda uzandığım zaman düşünürdüm.* M.S.Ordubadi. *Krovatların üstü səhərdən yığışdırıldığı üçün çox səliqəli görünürdü.* Ə.Vəliyev.

**KRUJEVA** [*rus.*] Paltarı və ya ev müxəlləfatını bəzəmək üçün şəbəkəli tor toxuma. *Krujeva yaxalıq. Krujeva pərdə. Krujeva toxumaq.*

**KRUJEVAÇI** *is.* Krujeva toxuyan, krujeva ustası.

**KRUJEVALI** *sif.* Krujevası olan, krujeva ilə bəzənmiş. *Pəncərələr krujevalı pərdələrlə örtülü idi..* S.Rəhman.

**KRUJKA** [*rus.*] b a x **parç.** *Bunu deyib leytenant qazançadan krujkaya çay tökdü.* Ə.Əbülhəsən.

**KUB**$^1$ [*yun.* kubos] 1. Bütün üzləri kvadrat olan altıüzlü cisim.

2. *riyaz.* Hər hansı bir kəmiyyətin özünə üç dəfə vurulmasından alınan hasil. *2 rəqəminin kubu 8-ə bərabərdir.*

3. *dan.* B a x **kubmetr.** *İki kub odun.*

**KUB**$^2$ [yunancadan] Maye qaynatmaq və ya distillə etmək üçün şar, ya silindr şəkilli qab.

**KUBAOXŞAR** b a x **kubşəkilli.**

**KUBATURA** [*rus.* əsli *yun.*] Bir şeyin həcminin kub hesabı ilə ölçüsü.

**KUBİK** [*rus.* əsli *yun.*] 1. Kubşəkilli kiçik şey.

2. Üzərində şəkillər yapışdırılmış kiçik kub şəklində taxta parçalarından ibarət uşaq oyuncağı. *Uşağa kubik almaq.*

3. Hündürlüyü 20 sm, eni 20 sm, uzunluğu isə 40 *sm* olan maşınla kəsilmiş (daş). *Kubik daşdan tikilmiş bina.* // Həmin ölçüdə olan daş. *Kubikdən ev tikmək.*

4. 1943-cü ildə sovet ordusunda poqon tətbiqinə qədər orta komanda heyətinin fərqlənmə nişanı. [Zəhranın] *ayağında dizdən əsgər çəkməsi, başında isti papağı, əynində boz şineli, şinelin yaxasında yaşıl rəngli ilgəklərin üstündə qoşa kubiklər vardı.* Ə.Vəliyev.

**KUBİZM** [*rus.* əsli *yun.*] XX əsrin birinci rübündə burjua təsviri incəsənətində real aləmdəki şeylərin təsvirini həndəsi fiqurların kombinasiyası ilə əvəz edən ifrat formalist cərəyan.

**KUBMÉTR** [*yun.* kubos və metron] Eni, uzunu və hündürlüyü metrlə hesablanan həcm ölçüsü. *İki kubmetr taxta.* – [Fərman:] *Mən də ilin axırına qədər 50 min kubmetr torpaq qazmağı boynuma götürürəm.* Ə.Sadıq.

**KUBMETRLİK** *sif.* Kubmetrlə ölçülən, kubmetr ölçüsündə olan (adətən rəqəmlərlə işlənir). *Beş kubmetrlik taxta.*

**KUBOK** [*rus.* əsli *yun.*] İdman yarışlarında qalib gələnə priz kimi verilən qiymətli vaz, qab. *Azərbaycan kuboku uğrunda futbol yarışları.*

**KUBŞƏKİLLİ** *sif.* Kub şəklində olan, kuba oxşayan; kubaoxşar.

**KUD** *is. məh.* Arı saxlanan səbət, arı səbəti.

**KUDU** b a x **qabaq¹.** *Yatma, kudu, bostana dovşan girər.* (Ata. sözü). *Kənd arvadları qışın tədarükünü qurtarırdı: kimi hazırladığı unu kəndiyə doldurur, kimisi yarmanı kisəyə yığır, kimisi yaman günün köməyi olan kudu və balqabaqları gizlədirdi.* M.İbrahimov. // Həmin tərəvəzdən bişirilmiş. *Kudu qutabı. Kudu qəlyəsi.*

**KUFİ** [İraqda Kufə şəhərinin adından]: **kufi xətt** – ərəb yazısının düz və bucaqlı cizgilərdən əmələ gələn formasının ən qədim adı. *Kitabələrdə kufi xətti get-gedə nəsx xətti ilə əvəz edilir.* Ə.Salamzadə.

**KUFUL** *is. dan.* Ağacın qurumuş yerlərində əmələ gələn boşluq; koğuş. *Bu pətəklər palıd ağaclarının kufullarında, koğuş yerlərində özlərinə yuva salar, hər bir arı nəsli uzun illər buradan ətraf meşəyə öz beçəsini – nəslini yayırdı.* S.Rəhimov. // *sif. mənasında.* İçi bu cür boş olan; koğuşlu.

**KUKLA** [*rus.* əsli *yun.*] 1. Adam, əksərən qız fiquru şəklində uşaq oyuncağı; gəlincik. *Uşağa kukla almaq. Kuklanı geyindirmək. – Ağca xanım anası gətirdiyi gözəl kuklalara .. baxıb çox şad oldu.* S.S.Axundov. *Yazıq anan necə dözsün; Bu kədərə, bu məlala? Məzarının baş ucunda kukla da var; Bu gün layla çalmalıykən sən kuklana; Kuklan sənə layla çalar.* B.Vahabzadə. // Xüsusi teatr tamaşalarında, oyunlarında istifadə olunan parça və s.-dən düzəldilmiş insan və ya heyvan fiqurları. ☐ **Kukla teatrı** – iştirakçıları kuklalar olan xüsusi teatr.

2. *dan.* Qəşəng geyinmiş, bəzənmiş gözəl qız, qadın haqqında. ☐ **Kukla kimi** – 1) çox qəşəng geyinmiş incə, gözəl qız, qadın haqqında; 2) cansız-ruhsuz, hərəkətsiz, müqəvva kimi. *Kukla kimi dayanmaq.*

**KUKLAÇI** *is.* Kukla qayırmaqla məşğul olan, kukla qayıran usta.

**KUKLUKSKLÁN** [*ing.* ku-klux-klan] ABŞ-da zəncilərə və qabaqcıl adamlara vəhşi divan tutan terrorçu təşkilat.

**KUKLUKSKLANÇI** *is.* Kukluksklan bandası iştirakçısı.

**KULA** *is. məh.* Odun, odun parçası. *Ocağa kula qoymaq. Kula doğramaq.*

**KULÁK** [*rus.*] b a x **qolçomaq** 1-ci mənada. [Mirzə Hüseyn:] *O yekəqarın kulakla nə söhbət eləyirdin?* Ə.Haqverdiyev. *Mədəd muzdurlar komitəsinin təlimatçılığı vəzifəsində çalışar, əsas etibarilə kulaklarla muzdurlar arasında şərtnamə bağlardı.* S.Rəhimov. *Buludların bağrını yarmaq istəyən zaman; Kulak pusquda durur gecə yam-yamlar kimi.* S.Rüstəm.

**KULMİNÁSİYA** [*lat.*] 1. *astr.* Göy cisminin müşahidə yerinin meridianından keçməsi.

2. *məc.* İnkişafın, yüksəlişin, gərginliyin ən yüksək momenti, dövrü. *Kələntərli deyirdi ki,*

[Sultan] *pəncərənin qabağına gedəndə bilin ki, qəzəbinin kulminasiyasıdır.* İ.Hüseynov.

3. Bədii hadisələrin inkişafında ən gərgin an.

**KULÓN**[1] [*xüs.* ad-dan] Elektrik cərəyanının ölçü vahidi.

**KULON**[2] [*fr.* coulant] Zəncirə bənd edilmiş qiymətli daş və ya daşlardan ibarət qadın boyunbağısı.

**KULTİVÁSİYA** [*fr.*] *k.t.* Torpağın kultivatorla becərilməsi, yumşaldılması. *Bütün yay müddətində* [manqa üzvləri] *altı dəfə kultivasiya, yeddi dəfə də kətmənləmə apardılar.* İ.Əfəndiyev. *Alaq, kultivasiya, kətmən, suvarma; Bizim işimizin əsil canıdır.* B.Vahabzadə. ☐ **Kultivasiya etmək (çəkmək)** – torpağı yumşaltmaq, belləmək, becərmək. *Sahədə cərgə aralarına çarpaz kultivasiya çəkilirdi.*

**KULTİVÁTOR** [*fr.* cultivateur] *k.t.* Şumlanmış torpağı yumşaltmaq, cərgələrarasını becərmək və s. üçün kənd təsərrüfat aləti. *Kultivatoru traktora qoşmaq. – Traktor və kultivator hələ də gəlib çıxmırdı.* Ə.Vəliyev.

**KULTİVATORÇU** *is.* Kultivatorda işləyən, kultivasiya edən işçi.

**KULTUROLOGİYA** *is.* [*lat. və yun.*] Mədəniyyəti öyrənən elm sahəsi.

**KULUF**[1] *is.* Divarın, hasarın altından su axmaq üçün açılan deşik, dəlik. *Qulu rütubətdə ölümün pəncəsində çapalayır, .. tezcə sürünüb kəhrizin kulufuna girir.* S.Rəhimov.

**KULUF**[2] *is. dan.* Tənə, sərki. ☐ **Kuluf vurmaq** – b a x **kuluflamaq.**

**KULUFLAMA** "Kuluflamaq"dan *f.is.*

**KULUFLAMAQ** *f.* Tənə vurmaq, sərkiləmək.

**KUMARÍN** *is.* [*fr.*] Təzə biçilmiş ot iyi verən sintetik maddə.

**KUMIS** b a x **qımız.**

**KUMPUL** *is. məh.* Ağır çəkic, iri çəkic.

**KUPÉ** [*fr.* coupe – kəsmək] Vaqonda bir neçə sərnişin üçün ayrıca bölmə, otaq. *İkiadamlıq kupe. Kupeyə girmək. – Kupedəki iki gənc məmnun baxışları ilə münaqişəni seyr edirdilər.* A.Şaiq. *Gecə qatarla yol getməkdən Sabitin zəndələn-zəhləsi gedirdi, çünki qaranlıq, dar kupedə uzananda iri bir qəbir gəlib dururdu gözlərinin qabağında..* İ.Məlikzadə.

**KUPLÉT** [*fr.* cuplet] 1. Şerin, mahnının iki, dörd və daha artıq misradan ibarət qitəsi, bəndi. *İki kuplet şeir. Mahnıdan bir kuplet oxumaq.*

2. Məişət və ya siyasi mövzuda, adətən, təkrar olunan nəqərat şəklində satirik və ya yumoristik kiçik mahnı (əsasən estradada oxunur). *Mahnı musiqisinin yaxşı yadda qalmasının bir səbəbi də odur ki, mahnı, adətən, kuplet formasında olur.* Ə.Bədəlbəyli. *Çarvadar Ciniş Əhmədin bir neçə gün əvvəl şəhərdən gətirdiyi bu məzəli kupleti .. cavanlar bərkdən-bərkdən oxuyur, dağa-daşa səs salırdılar.* Ə.Əbülhəsən.

**KUPLETÇİ** *is.* Kuplet ifa edən estrada artisti.

**KUPÓN** [*fr.*] 1. Qiymətli kağızlardan faiz almaq üçün onlardan kəsilən talon.

2. *xüs.* Teatr lojasında bir yerin bileti.

**KURA** *is. bot.* Sarı rəngli yabanı yeməli bitki.

**KURALIQ** *is.* Çoxlu kura bitmiş yer.

**KURÁTOR** *is.* [*lat.*] Müəyyən işin gedişinə, icrasına nəzarət etməli olan şəxs, təşkilat.

**KURÓRT** [*alm.*] Təbii şəraiti (havası, mədən suları, palçığı və s.) müalicə və istirahət üçün əlverişli olan yer. *İstisu kurortu. Qışı böyük şəhərlərdə; Yayı – dağda kurortlarda dincəlirik; Ancaq yenə biz bilirik; Nəsə çatmır…* B.Vahabzadə.

**KURORTÇU** *is.* Kurortda müalicə olunan, kurortda istirahət edən adam. *Plyaj kurortçularla dolu idi.*

**KURORTOLÓGİYA** [*alm.*] Təbii müalicə yerlərindən və müalicə məqsədilə onlardan istifadə olunması üsullarından bəhs edən elm.

**KURORTOLOJİ** *sif.* Kurortologiyaya aid olan. *Kurortoloji tədqiqat.*

**KURORTÓLOQ** [*alm.* Kurort və *yun.* logos-dan] Kurortologiya mütəxəssisi, alimi.

**KURORTŞÜNAS** [*alm.* Kurort və *fars.* ...şünas] b a x **kurortoloq.**

**KURORTŞÜNASLIQ** b a x **kurortologiya.**

**KURS** [*lat.* cursus-dan] 1. Ali məktəbdə hər hansı bir fənnin, həmçinin onun ayrıca hissəsinin sistematik şərhi, habelə həmin fənnə aid dərslik. *Siyasi tarix kursu. Mexanika kursu. – Biz botanika kursundan bilirik ki, armudun çiçəklərində həm erkəkciklər, həm də*

*dişiciklər olur.* M.Axundov. // Təhsil dövrü, təhsil müddəti. *Orta məktəb kursu. – ..Gimnaziyanın kursunu tamam etməyə üç-dörd ay qalmış müəllimlərin cövr-sitəminə artıq təhəmmül edə bilməyib, şair ata və ananın izni ilə oradan çıxır..* F.Köçərli. // Ali və orta ixtisas məktəblərində ayrıca illik təhsil pilləsi. *Beşinci kurs tələbəsi. Birinci kursa qəbul olunmaq.*

2. Dar ixtisas verən və ya ixtisası artıran tədris müəssisəsi (çox vaxt cəm şəklində işlənir). *İxtisasartırma kursları. Traktorçuluq kursu. Gecə kursu. –* [Usta Məhərrəm:] *Sizin canınız üçün, bir çox naxoşluqlar var ki, kurs qurtarmış həkimlər dərmanından acizdirlər.* Ü.Hacıbəyov. *Vaxtında təhsil almaqdan məhrum edilmiş qadınlar üçün xüsusi kurslar tərtib olundu.* T.Ş.Simurq.

3. Müalicə prosedurunun tam müddəti, tsikli. *Müalicə kursunu başa çatdırmaq. Beş kurs vanna qəbul etmək.*

4. Məzənnə. *..Buyurub qiymət edin, günün kursu ilə ingilis və Amerika pulu verim.* M.S.Ordubadi.

**KURSÁNT** [*rus.* əsli *lat.*] Kurs tələbəsi. *Elə oradaca bir neçə kursant dururdu.* Ə.Əbülhəsən. // Hərbi məktəb müdavimi.

**KURSÍV** [*lat.*] Əlyazısına oxşar mailli mətbəə şrifti.

◊ **Kursiv mənimdir (bizimdir)** – sitatda kursivlə çap olunmuş sözlərin orijinalda deyil, (nəzərə çarpdırmaq üçün) sitatı gətirənin özü tərəfindən ayrıldığını göstərən ifadə.

**KURSUVKA** [*rus.* əsli *lat.*] Kurortda sanatoriyada qalmamaq şərtilə müalicə və yeməkdən istifadə etməyə icazə verən sənəd.

**KURYÉR** [*fr.*] 1. İdarə kağızlarını aparıb paylayan işçi; ayaqçı. *Gərək yazıq kuryerə vədə verdiyin yaylaq məzuniyyətini bir qədər xərcliklə bu gün verəydin, verməmisən.* C.Məmmədquluzadə. *Hər namuslu vətəndaşın bizim evdə əzizdir; Alim, kuryer, daşyonan, toxucu qadın, əsgər.* R.Rza.

2. Təcili, yaxud məxfi diplomatik poçtu özü ilə aparan vəzifəli şəxs. *Diplomatik kuryer.*

**KUS** *is.* [*fars.*] *klas.* Böyük nağara, iri təbil. *Fəryadıma həmdəm et xorusu; Avazıma qoş sədayi-kusu.* Füzuli. *Kus, nağara çalınır qan almağa; O, Şeyx oğlu Şah Abbasın günüdür.* "Koroğlu".

**KUSTAR** [*rus.*] 1. Əl üsulu ilə mal istehsal edən sənətkar, peşəkar. *Zeynal ilə Əziz bir-iki nəfər dərzini, başmaqçını və dəzgah qurub özü üçün işləyən bir neçə nəfər kustarı da çağırmaq istəmişdilərsə də Veys: – Olmaz! – deyib qəti etiraz etmişdi.* Ə.Əbülhəsən. // Əl üsulu ilə mal istehsal edən. *Mən bütün kustar sənaye müəssisələrinin təşkili məsələsini də .. müzakirə sırasına keçirdim.* M.S.Ordubadi. *Bu, əlliyə qədər uşaq və qadın işləyən bir kustar emalatxanasıdır.* M.İbrahimov.

2. Fabrikdə deyil, əl üsulu ilə istehsal edilmiş, hazırlanmış. *Kustar məmulatı.* // *məc.* Primitiv, ibtidai, qeyri-kamil.

**KUSTARCASINA** *zərf* İbtidai, primitiv, sistemsiz üsullarla; qeyri-mütəşəkkil. *Kustarcasına işləmək.*

**KUSTARLIQ, KUSTARÇILIQ** *is.* 1. Kustar əməyi ilə məşğul olma, kustarın işi, peşəsi, sənəti.

2. *məc.* Qeyri-mütəşəkkil, dağınıq, primitiv üsullarla aparılan iş.

**KUT** *is. dan.* 1. Topa, qalaq. *Bir kut alma. Bir kut odun.*

2. Qalın, sıx, gur, seyrək olmayan. *İndi Rüstəmin qara kut saçları çoxdan seyrəkləşmiş və çallaşmışdı.* M.İbrahimov.

3. Dəstə, toplu. *Bir kut adam.*

**KUT-KUT** *zərf* və *sif.* Yığın halında, topa halında; qalaq-qalaq, yığın-yığın. *Adamlar kut-kut olublar. Küləşi kut-kut yığmaq.*

**KUTLAMA** "Kutlamaq"dan *f.is.*

**KUTLAMAQ** *f.* Bir yerə toplamaq, yığmaq, kut etmək. *Otu kutlamaq. Torpağı kutlamaq.*

**KUTLAŞDIRMA** "Kutlaşdırmaq"dan *f.is.*

**KUTLAŞDIRMAQ** b a x **kutlamaq.** *Zibili kutlaşdırmaq.*

**KUTLAŞMAQ** *f.* Bir yerə yığılmaq, toplaşmaq. *Uşaqlar bir az da kutlaşıb nə olacağını gözlədilər.* M.İbrahimov. *..Onlar bir-birini basa-basa dar bir dairədə kutlaşır, sanki şübhə ilə oğlanın çomağına baxırdılar.* İ.Hüseynov.

**KUZA** [*rus.*] *dan.* b a x **ban**[1] 1-ci mənada. *Kuzadan qısaboylu, enlikürəkli cavan bir oğlan yerə tullandı.* Ə.Əbülhəsən.

**KUZƏ** *is.* [*fars.*] Darboğazlı, aşağısı enli, qulplu saxsı su qabı; balaca səhəng, bardaq. *İnci cəld kənarda olan şərab kuzəsini götürüb*

*Ulucaya yaxınlaşır.* A.Şaiq. *Şofer vedrəni, Qulam müəllim də kuzəni götürüb üzüaşağı dərəyə tərəf sallandılar.* S.Rəhimov. [Bəy:] *Qədir, o kuzədən bir qurtum su ver, içim.* Mir Cəlal.

**KUZƏÇİ** *is. köhn.* Gildən kuzə qayıran usta, dulusçu. [Əbdək:] *Mən kuzəçiyəm, memarlıq da edirəm.* M.Hüseyn. // Kuzə qayrılıb satılan yer. *Kuzəçi dükanı.*

**KUZƏÇİLİK** *is.* Kuzəçinin işi, peşəsi; dulusçuluq.

**KÜ** b a x **küy.** [Səfər bəy:] *Gedək aşağıda kü salaq.* M.F.Axundzadə.

**KÜBAR** [*ər.*] *sif.* və *is.* 1. Əsilzadə, aristokrat. *Mən zəngin və kübar ailələrdən çıxan qızların birisini də ağıllı görmədim.* M.S.Ordubadi. *Burada Tehranın bütün kübar ailələrindən cavan kişi və qadınlara, oğlan və qızlara rast gəlmək mümkün idi..* M.İbrahimov. *Şeir gəzdi dilləri, gəlib çatdı saraya; Aldı yaltaq kübarlar Zülfüqarı araya.* B.Vahabzadə.

2. *köhn.* İncə zövqlü, incə təbiətli və davranışlı adam haqqında.

3. Özünü kütlədən ayıran, başqalarına xor baxan: təkəbbürlü, mütəkəbbir adam haqqında.

**KÜBARANƏ** [*ər.* kübar və *fars.* ...anə] b a x **kübarcasına.**

**KÜBARCA** b a x **kübarcasına.** *Sabbah və Xəyyam kübarca geyinmiş və üzləri taraş edilmiş gələrlər.* H.Cavid.

**KÜBARCASINA** *zərf* Kübar adamlara xas olan bir tərzdə, kübar kimi; aristokratcasına. *Kübarcasına yaşamaq.*

**KÜBARLIQ** *is.* Əsilzadəlik, aristokratlıq. *Kübar ailədə yer tutmaq üçün gözəllik rol oynamır, başlıca rolu zənginlik və kübarlıq oynayır.* M.S.Ordubadi.

**KÜÇƏ** *is.* 1. Nəqliyyatın və adamların hərəkəti üçün yaşayış məntəqələrində iki sıra tikililər arasındakı açıq sahə, boş yer, yol. *Küçənin qarını təmizləmək. Küçəni süpürmək. İstiqlaliyyət küçəsində yaşamaq. – Kətxudalar Qəzvinin küçələrini natəmiz saxlayırdılar.* M.F.Axundzadə. *Küçənin ortasında bir dəstə əsgər oxuya-oxuya addımlayırdılar.* C.Məmmədquluzadə. *Yan küçədən çıxan bir qaraltı onun qarşısında dayandı.* Ə.Sadıq. ◻ **Küçə həyatı keçirmək** – avara, sərsəri həyat keçirmək, avaralanmaq, heç bir işlə məşğul olmamaq. *Zeynalın, başqa özü kimi səfilcəsinə küçə həyatı keçirən yoldaşları Mehribanın gözü qabağında keflənmişdilər.* S.Hüseyn. **Küçə qadını (arvadı, uşağı, adamı)** – tərbiyəsiz, əxlaqsız, baxımsız qadın (arvad, uşaq, adam). *Küçə uşaqlarına qoşulmaq. Küçə adamına baş qoşmamaq. – Qətibə, Qızıl Arslan sarayının qarşısına yetişənə qədər başını taxt-rəvanın pəncərəsindən çıxarıb küçəyə baxmaq istəmirdi, çünki o, küçə uşaqlarının qışqırtısını eşitdikcə əsəbiləşirdi.* M.S.Ordubadi. **Küçə mirzəsi** *köhn.* – keçmişdə küçədə oturub savadsız əhali üçün məktub, ərizə və s. yazan savadlı adam; mirzə. *Mirzə Cavad küçə mirzəsi idi.* Ə.Haqverdiyev. **Küçə səngəri** – b a x **barrikada. Küçə sözü** – ədəbsiz söz(lər), söyüş. [Aygün:] – *Əvvəl, mənə aşna demə! Bir anayam mən! Bizim evə yaraşmayır bu küçə sözü...* S.Vurğun.

2. Binanın küçə tərəfi, küçə səmti. *Küçəyə pəncərə açmaq.* ◻ **Küçə qapısı** – 1) evdən küçəyə açılan qapı. *Küçə qapısını örtmək;* 2) həyətdən küçəyə açılan qapı. *Məmmədhəsən əmi həyəti bir qədər dolanıb çıxdı küçə qapısının ağzına.* C.Məmmədquluzadə. *Küçə qapısı açıldı.* S.Hüseyn. **Küçə pəncərəsi** – evdən küçəyə açılan pəncərə. *Küçə pəncərəsini bağlamaq.* **Küçəyə baxmaq** – küçəyə açılmaq, küçəyə tərəf olmaq, küçəyə çıxmaq. *Eyvan küçəyə baxır. – Küçəyə baxan pəncərələrin çoxunun taxtası bağlandığından, yuxarı başa qaranlıq çökmüşdü.* İ.Şıxlı.

◊ **O küçə sənin, bu küçə mənim** – çox gəzib yorulmaq, bütün küçələri dolanıb əldən düşmək. [Fatma həkim:] *Otuz beş ildi uçastkovı həkim işləyirəm, bu küçə mənim, o küçə sənin, bu dalan sənin, o dalan mənim. Heç olmasa işdən qayıdanda evdə bir rahatlıq görəsən.* İ.Məlikzadə.

**KÜÇƏ-BAZAR** *top.* Küçələr və bazarlar birlikdə; küçələr, bazarlar. *Bu məsələ yalnız qəzetlərdə deyil, küçə-bazarda, meydan və yığıncaqlarda da insanları məşğul edirdi.* M.İbrahimov. *Küçə-bazardan adamın ayağı çəkilirdisə də, çay qırağından hələ çalğı səsi eşidilirdi.* Ə.Əbülhəsən.

**KÜÇƏBƏKÜÇƏ** *zərf* Bir küçədən o biri küçəyə, bütün və ya çox küçələri; küçə-küçə. *Küçəbəküçə gəzmək. – "Nicat"ı küçəbəküçə*

*soraq edir, nə əcəb? Bu millət, ay baba, lap ittifaq edir, nə əcəb?* C.Cabbarlı.

**KÜÇƏSÜPÜRƏN** *sif.* və *is.* İşi küçələri süpürməkdən ibarət olan; süpürgəçi. *Küçəsüpürən qadın. Küçəsüpürənləri çağırmaq. – Hamballar, küçəsüpürənlər belə öz səslərini fəhlələrin ümumi səsinə qarışdırdılar.* M.S.Ordubadi. // bax **küçətəmizləyən.**

**KÜÇƏTƏMİZLƏYƏN** *is.* Küçənin qarını, zibilini və s.-ni təmizləyən avtomaşın. // Sif. mənasında. *Küçətəmizləyən maşın.*

**KÜÇƏYUYAN** *is.* Küçələri yumaq üçün xüsusi avtomaşın. // Sif. mənasında. *Küçəyuyan maşın.*

**KÜÇÜK** *is.* 1. İt balası. *Küçüyü qovmaq. Küçüyü yedirtmək.*

2. Uşaq, bala mənasında (yüngül söyüş kimi işlənir). *Küçüyün biri.* – [Rəhim xan:] *Amma məni heç bir şey yandırmırdı, o balaca küçük Nadirin öyünməsi.* C.Cabbarlı. [Hacı Manaf:] *Axtar, küçüyün atasını tap!* S.Hüseyn. [Cəmilə:] *..Hara gedəcəksə, qoy getsin, .. küçüklərini də hara aparırsa, aparsın.* E.Sultanov.

3. *dan.* bax **bic²**. *Köklərdə əlavə tumurcuqlar .. yan köklər kimi, kökün daxili hissəsindən, yəni mərkəzi silindrdən əmələ gəlir, .. sonralar inkişaf edərək torpaq üzərində yarpaqları olan zoğlar verir ki, bunlara küçük və ya bic deyilir..* M.Qasımov.

4. Bəzən "kiçik" əvəzinə işlənmişdir. *Hey fələk, gör necə günlər gördük; Azdı hər kəs, nə böyük var, nə küçük..* H.Cavid.

**KÜÇÜKLƏMƏ** "Küçükləmək"dən *f.is.*

**KÜÇÜKLƏMƏK** *f.* 1. Balalamaq, doğmaq (it cinsindən olan heyvanlar haqqında). *Köpək küçüklədi. Qurd küçüklədi.*

2. *vulq.* Doğmaq (təhqir məqamında). *Qızı küçükləyəndə, adam bilib subaylığım ilə 40 manat xərcə düşdüm.* Mir Cəlal.

3. Ağacın dibindən zoğlar çıxmaq, bic vermək.

**KÜÇÜKLƏNMƏ** "Küçüklənmək"dən *f.is.*

**KÜÇÜKLƏNMƏK** *f.* Yaltaqlanmaq.

**KÜDURƏT** [*ər.*] 1. Kin, ədavət, nifrət. [Yusif:] *Mənim ürəyimdə bir kin, küdurət yoxdur.* N.Nərimanov. *Ürəyimdə* [Xədicəyə] *qarşı bəslədiyim küdurəti unutdum.* S.Hüseyn.

2. Qəm, dərd, bəla. *Üz qoyub üstünə küdurətü qəm; Yaş tökülür gözlərindən dəmadəm.* Q.Zakir. *Açdın gözünü rəncü məşəqqət görəcəksən; Millətdə qəm, ümmətdə küdurət görəcəksən.* M.Ə.Sabir.

**KÜDURƏTLİ** *sif.* 1. Ürəyi qəmli, dərdli, kədərli.

2. Küdurət saxlayan, kin bəsləyən, ədavəti olan. *Küdurətli adam.*

**KÜDURƏTLİLİK** *is.* Küdurətli adamın hal və keyfiyyəti.

**KÜDÜL** *sif. məh.* Quyruğu olmayan, quyruqsuz.

**KÜFLƏ** *is.* 1. Bax **külbə¹** 1-ci mənada.

2. *məc.* İri, yastı burun.

**KÜFLƏT** *dan.* bax **külfət.** [Rəhim:] *Mən Rüstəm xanın oğluyam, qaçaqlar küflətimizi əsir eylədilər.* N.Vəzirov.

**KÜFR** *is.* [*ər.*] Dinin, Allahın varlığı və birliyi kimi əsaslarını təşkil edən müddəaları danma və bu barədə deyilən söz. ☐ **Küfr danışmaq (söyləmək)** – Allahı, dini danmaq, təhqir etmək, söymək. *Nə dedin? Küfr danışdın, cıraram ağzını, ha!* M.Ə.Sabir. *Küfr, nasaza danışmaq, hərgiz heç bir kəs üçün rəva deyil.* C.Məmmədquluzadə. [Baftan:] *Küfr danışma, qoca, istərəm əlahəzrətin sağlığına zəhər içərəm, istərəm lap iblis ilə öpüşərəm!* Ə.Məmmədxanlı. // Dinsizlik, allahsızlıq. [Birisi:] *Biz də .. Hər bir yol ilə camaatı elmdən saxlayırdıq və elm dalınca gedənlərin küfrünə hökm edirdik.* Ə.Haqverdiyev. *Nəhayət, islahat təşəbbüslərinə bir küfr təşkilatı kimi baxılırdı.* M.S.Ordubadi.

**KÜFRAN** *is.* [*ər.*] *klas.* Yaxşılığı itirmə; nankorluq. ☐ **Küfran eləmək** – yaxşılığı itirmək, nankorluq eləmək. *Küfran elədik, sanki bu nemət götürüldü; Millətdə olan büsbütün adət götürüldü.* M.Ə.Sabir.

**KÜFTƏ** *is.* [*fars.*] 1. Bax **küftəbozbaş.** *Küftə bişirmək. – Kişmişdən, badamdan, nanü həlvadən; Qovurmadan, .. küftə, dolmadan verdilər.* Q.Zakir. [Seyid:] *Müsəlman aşpazı saxlayıram, gözəl plov, dovğa, dolma, küftə bişirir ki, ölü yesə dirilər..* Ə.Haqverdiyev. [Rüstəm Səkinəyə:] *Arvad, küftənin iyi ətir kimi bir kilometrdən vurur.* M.İbrahimov.

2. Küftəbozbaşa, xəmiraşıya, sulu xörəklərə salınmaq üçün döyülmüş ət yumruları. *Küftə tutmaq. Küftə qayırmaq.*

**KÜFTƏBOZBAŞ** *is.* Küftə, kartof, noxud və s.-dən hazırlanan bozbaş növü. *Küftə-*

*bozbaş bişirmək.* – [Səkinə] *küftəbozbaş dolu qazanın ağzını örtmüşdü.* M.İbrahimov.

**KÜFTƏLİK** *sif.* Küftəyə yarayan, küftə üçün olan. *Küftəlik ət. Üç kiloqram küftəlik bud almaq.*

**KÜKNAR** *is. bot.* Konusvari uzun qozaları olan iri, həmişəyaşıl iynəyarpaqlı ağac. *Uzaq şimal tayqasında ayaq xizəyində quş kimi süzən bir gənc uca bir küknarın dibində bir anlığa durub tüfəngini çiynindən aşırır.* M.Rzaquluzadə. *Pəncərədən küknar ağaclarının xoş iyi baharın nəfəsinə qarışaraq qucaq-qucaq içəriyə dolurdu.* Q.İlkin.

**KÜKNARLIQ** *is.* Çoxlu küknar ağacları bitmiş yer; küknar.

**KÜKRƏK** *sif.* Coşqun, daşqın, kükrəyən, aşıb-daşan. *Kükrək çay.* – *Sanki bayraq deyil o; Birləşmişdi dil-dilə; Kükrək qızıl alovlar.* R.Rza.

**KÜKRƏKLİK** *is.* Kükrək şeyin halı; coşma, aşıb-daşma, kükrəmə.

**KÜKRƏMƏ** "Kükrəmək"dən *f.is.*

**KÜKRƏMƏK** *f.* Hirslənərək özündən çıxmaq, bərk qızmaq; coşmaq. *Xüsusən bacısı Xədicə Hacının üstünə kükrəyərək: – Necə, peyğəmbəri, bu nə sözdür?* A.Şaiq. [Bəhlul:] *Burda mənim günahım nədir, üstümə bu cür kükrəyirsən?* M.Hüseynov. // *məc. mənada.* Həddindən artıq qalxmaq, yüksəlmək, qabarmaq. *Qocaman dalğalar hücum edərək; Çıldırıb hıçqırırdı kükrəyərək.* H.Cavid. *Gənc bir arslan kimi kükrəyən Aras; Vermiş ətrafına dərin bir həras.* M.Müşfiq. *Külək harın bir at kimi kükrəyib vıyıldayır və ananın qəlbini üzürdü.* Q.İlkin.

**KÜKÜ** *is.* Göyərti və yumurtadan (bəzən də balıqdan) hazırlanan xörək. *Kükü bişirmək.* – *Bəylər yeyər nahara küftə, kabab və kükü; Məsciddə eylər amma ahü-fəğan orucluq.* M.Möcüz. *Elə beləcə ailə üzvləri günorta vaxtı oturub kükü yeyirdilər.* Ə.Əbülhəsən.

**KÜKÜLÜK** *sif.* Kükü üçün yararlı, kükü üçün olan (göyərti və s.). *Kükülük göyərti almaq. Kükülük balıq təmizləmək.*

**KÜKÜRD** *is.* Sənayedə, kənd təsərrüfatında, tibdə işlənən sarı rəngli tezalışan kimyəvi maddə.

**KÜKÜRDLƏMƏ** "Kükürdləmək"dən *f.is.*

**KÜKÜRDLƏMƏK** *f.* Kükürd tozu səpmək, kükürd sürtmək. *Bitkiləri kükürdləmək.*

**KÜKÜRDLÜ** *sif.* Tərkibində kükürd olan, kükürdlə qarışığı olan. *Kükürdlü birləşmələr.*

**KÜL** *is.* Yanmış şeylərdən qalan boz-qara rəngli toz. *Külü atmaq. Külü təmizləmək.* – *Bir soyuq kül o yerdə qaldı nişan: Onu da yel sovurdu sağ və sola.* A.Səhhət. *Usta Zeynal çubuğu çəkib külünü boşaltdı və durdu ayağa..* C.Məmmədquluzadə. [Dərviş:] *Ocağın alovu sönüb tamam olurdu, qıraqlardakı atəşləri kül yavaş-yavaş .. bürüyürdü.* A.Divanbəyoğlu. □ **Kül olmaq** – bütünlüklə yanmaq, yanıb qurtarmaq, külə dönmək. *Odunlar kül oldu. Cəsarət gərəkdir ilk sevənlərə; Yalandı kül olmaq, yalandı yanmaq!* M.Araz. **Kül suyu** *k.t.* – bitkiləri dezinfeksiya etmək üçün suda həll olunmuş kül.

◊ **Kül başına! (gözünə!)** *dan.* – qarğış, danlaq və təkfir ifadəsi. *Kül başına, gözəl fərə, beçə də səni bəyənmir.* (Ata. sözü). [Tağı qızı:] *Pah, kül başına! Mənim evimdə qoca nə gəzir?* M.S.Ordubadi. [Şahsənəm:] *Belə kül molla başına!* S.S.Axundov. **Kül etmək (eləmək)** – puç etmək, məhv etmək, axırına çıxmaq. *Var-dövləti kül etmək.* // məc. Mənada. *Məni kül elədi elin dilləri.* Aşıq Məmməd. **Külə dönmək** – 1) yanıb qurtarmaq, kül olmaq. *Kömürlər külə döndü. Ağaclar yanıb külə döndü.* – *Neçin onun bu eyvanı; Yanıb soyuq külə döndü?* S.Vurğun. // *məc.* *Yox olmaq, məhv olmaq. Külə dönsün köləlik alışan bu səhərdə.* R.Rza; 2) *məc.* çox əziyyət çəkmək, həddindən artıq əzab çəkmək. *Ana yetimləri böyütdükcə külə döndü.* – *Axı bu torpaqda doğulmuşam mən; Vətən həsrətilə külə dönmüşəm.* B.Vahabzadə. **Külü göyə sovrulmaq** – tamam məhv edilmək, axırına çıxılmaq. *Qoy düşmən ah çəksin, külü göyə sovrulub..* Ə.Vəliyev. **Külünü göyə sovurmaq** – tamamilə məhv etmək, axırına çıxmaq. *Gələndə düşmənlə süngü-süngüyə; Bir nərən sovurur külünü göyə.* S.Vurğun. **Başına kül (olsun)!** – b a x **baş. Gözə kül üfürmək** – b a x **göz.**

**KÜLAFİRƏNGİ** *is.* [əsli fransızcadan] 1. *köhn.* İri daş balkon (sarayda, qəsrdə və s.-də). *Padşah genə külafirəngidə əyləşib, dizlərin qucaqlayıb qəm dəryasına batmışdı ki, bir də gördü, həmən minval qiyamət baş-*

*ladı..* (Nağıl). *Xan qızı bütün günü sarayın külafirəngisinə çəkilir..* Çəmənzəminli.

2. *dan.* Evin üstündə və ya bağlarda istirahət üçün üstüörtülü tikili; talvar.

**KÜLAH** *is.* [*fars.*] *köhn.* Papaq. *Qoyma külahın kəc, a bəy, aldatma cahani; Bəsdir, a filani!* M.Ə.Sabir. *Aylar ilə işlənmiş mahud külahı dala tərəf sürüşmüşdü.* A.Divanbəyoğlu.

**KÜLAHDUZ** *is.* [*fars.*] *köhn.* Papaqçı. *Yaman külahduzdan yaxşı palanduz yaxşıdır.* (Ata. sözü).

**KÜLATAN** b a x **xəkəndaz.**

**KÜLBAŞ** *is. dan.* Bədbəxt, işi düz gətirməyən, zərərdidə, pisgünlü. // Qarğış, danlaq, təhqir məqamında. [Mahmudun arvadı:] *Ay külbaş! Mənə bir dəst paltar ala bilməyirsən, sənə nə olub ki, dəvə boyda qızı da evində saxlayıb bəsləyirsən?!* B.Talıblı. *Biz almışıq övrəti can-baş desin; Almamışıq hey bizə külbaş desin.* Ə.Nəzmi.

**KÜLBAŞLIQ** *is.* Bədbəxtlik, yazıqlıq; pis günə qalmış adamın hal və vəziyyəti.

**KÜLBƏ**[1] *is.* 1. Təndirdə, kürədə hava çəkmək üçün deşik. *Təndirin külbəsini açmaq.*

2. Nehrənin deşiyi.

**KÜLBƏ**[2] [*fars.*] *köhn.* Koma, daxma, qazma. *Külbeyi-hicranda qalmışam həzin; O şahibazımın çəkərəm qəmin.* Aşıq Kərim.

**KÜLBƏLƏMƏ** "Külbələmək"dən *f.is.*

**KÜLBƏLƏMƏK** *f.* Təndirin, kürənin külbəsini qapamaq (b a x **külbə**[1] 1-ci mənada).

**KÜLÇƏ**[1] *is.* Tərkibində metal və metal birləşmələri və ya faydalı minerallar olan maddə, süxur. *Dəmir külçəsi. Mis külçəsi.*

**KÜLÇƏ**[2] *is.* Yasda halva ilə paylanan çörək. *Sağlığında badam yeməyib, külçəsinə badam vururlar.* (Ata. sözü). *Qazanla və nimçələrlə plovu, halvanı, külçələri həzm-rabedən keçirən dövlətlilər və mollalar idi.* H.Sarabski. [Rəşid:] *Həmin kəndli bizim kəndlidir, a kişi, Qara İsrafilin oğludur da. Külçə oğurlayan Fətinin qardaşı oğlu.* T.Ş.Simurq. // Xəmiri xüsusi yoğrularaq təndirdə bişirilən üstü naxışlı çörək növü. *Külçəyə ədvə vurmaq. Səfər üçün külçə bişirmək.*

**KÜLÇƏLƏNMƏ** "Külçələnmək"dən *f.is.*

**KÜLÇƏLƏNMƏK** *f.* Burulmaq, yumrulanmaq, qıvrıq şəkil almaq. *İlan külçələndi.*

**KÜLƏ** *sif. məh.* Quyruqsuz. *Külə keçi.*

**KÜLƏCƏ** *is. köhn.* Boynuna, ətəyinə, yaxasına və qol yerlərinin kənarına xəz və s. tikilmiş qolsuz üst geyimi; kürdü. [Ağa Mərdan:] *Səbr elə, bir tirmə küləcəmi geyim, mahud cübbəmi bürünüm.* M.F.Axundzadə. *Əynində atlaz küləcə; Üstündə baftası qəşəng.* Aşıq Ələsgər. [Kənd qızları] *yeridikcə köynəklərinin ətəklərinə, küləcələrinin yaxalarına tikdikləri sarmalar, gümüş pullar səslənirdi.* Ə.Abasov.

**KÜLƏÇALAN, KÜLƏÇALAR** *sif.* Külə bənzəyən, külə oxşayan, kül rəngində olan, külrəngi. *Küləçalan torpaq.*

**KÜLƏK** *is.* 1. Havanın üfüqi istiqamətdə hərəkətindən ibarət təbiət hadisəsi; yel. *Külək əsir. Külək birdən kəsdi. Külək tutan yer.* – *Gecələr, gecələr, sonsuz gecələr; Çılğın küləkləri quduz gecələr!* M.Müşfiq. *Külək* [Dürrənin] *getməsinə mane olub paltarını sanki cırmaq istəyirdi..* S.Vəliyev. ☐ **Külək mühərriki** – külək vasitəsilə hərəkətə gələn mühərrik.

2. *məc.* Təşbehlərdə sürət, itilik, cəldlik mənasında. *Külək kimi yerimək.* – *Qoymaram başına açsınlar kələk; Duruşun buluddur, yerişin külək.* M.Müşfiq.

◊ **Külək hayana əssə, o yana əsmək** – möhkəm əqidəyə sahib olmamaq, tez vəziyyətə uyğunlaşmaq, fikrində sabit olmamaq.

**KÜLƏKKEŞ** b a x **küləklik.**

**KÜLƏKLƏMƏ** "Küləkləmək"dən *f.is.*

**KÜLƏKLƏMƏK** *f.* 1. Külək əsmək, külək olmaq. *Hava küləkləyir.*

2. Süni surətdə yel, külək yaratmaq. *Yelpiklə özünü küləkləmək. Ocağı paltarın ətəyi ilə küləkləmək. Ventilyator küləkləyir.*

**KÜLƏKLƏNMƏ** "Küləklənmək"dən *f.is.*

**KÜLƏKLƏNMƏK** *məch.* 1. Külək döymək, külək vurmaq. *Sərilən paltarlar küləklənir.*

2. Özünü küləyə vermək, sərinlənmək. *Nə küləklənirsən?*

**KÜLƏKLİ** *sif.* Külək olan, külək əsən. *Küləkli gün. Küləkli hava.* – *Küləkli bir yaz günü idi.* A.Şaiq. *Yenicə yarpaq açmış budaqlarda yellənən quşlar isə küləkli gecənin təlaş dolu mürgüsündən sonra indi bir az da dincəlib sakit oldular.* Ə.Məmmədxanlı. *Bu gün xoş, günəşli, işıqlı olan hava sabahı bu-*

*ludlu, küləkli, çiskinli bir hal alır.* M.Rzaquluzadə.

**KÜLƏKLİK** *is.* Hava çəkmək üçün binalarda olan deşik, dəlik, oyuq.

**KÜLƏKLİ-QARLI** *sif.* Həm külək əsən, həm də qar yağan. *Küləkli-qarlı gün. Küləkli-qarlı hava.*

**KÜLƏKLİLİK** *is.* Küləkli havanın və ya yerin halı, xüsusiyyəti.

**KÜLƏKLİ-TUFANLI** *sif.* Həm külək əsən, həm də tufan olan. *Küləkli-tufanlı gecə.* [Gəray ağa:] *Biz bu hisli-paslı, tozlu-torpaqlı, küləkli-tufanlı xarabaya öz dərdimizi ağlamaq üçün gəlmişdik!* S.Rəhimov.

**KÜLƏKLİ-YAĞIŞLI** *sif.* Həm külək əsən, həm də yağış yağan. *Küləkli-yağışlı hava. – Nəhayət, küləkli-yağışlı bir gündə* [Həsəni] *buraxdılar.* S.Rəhman.

**KÜLƏKÖLÇƏN** *is. xüs.* Küləyin gücünü və istiqamətini ölçmək üçün cihaz.

**KÜLƏKSİZ** *sif.* 1. Külək olmayan, sakit. *Küləksiz hava.*

2. Külək tutmayan, külək olmayan. *Küləksiz yer.*

**KÜLƏKSİZLİK** *is.* Küləksiz yerin və ya havanın halı, xüsusiyyəti.

**KÜLƏKTUTAN** *sif.* Daim külək olan, küləyə məruz qalan. *Evin küləktutan tərəfi.*

**KÜLƏŞ** *is.* 1. Taxıl döyüldükdən sonra qalan quru çöplər; iri saman. *Dəni küləşdən ayırmaq. Damı küləşlə örtmək. – Məşədi Ağakişi əlində yaba küləşi eşələyib qarışdırır.* C.Məmmədquluzadə. *Məktəb binası köhnə, üstü küləşlə örtülmüş yastı-yapalaq bir dam idi.* Q.İlkin. // Bəzən həsir mənasında. [Zirzəmiyə] *küləş şlyapalı uzun bir adam girdi.* S.Vəliyev.

2. *məh.* b a x **kövşən** 2-ci mənada. *Safo .. ya ayaqyalın, ya yamaqlı bir çarıqda gəzir, onun-bunun küləşində başaqçılıq eləyir.* S.Rəhimov.

**KÜLƏŞDOĞRAYAN** *is.* Küləşi doğrayıb saman halına salan maşın. // Sif. mənasında. *Küləşdoğrayan maşın.*

**KÜLƏŞLƏMƏ** "Küləşləmək"dən *f.is.*

**KÜLƏŞLƏMƏK** *f.* Küləşlə örtmək; üstünə küləş salmaq, küləş döşəmək. *Tövlənin damını küləşləmək.*

**KÜLƏŞLƏNMƏ** "Küləşlənmək"dən *f.is.*

**KÜLƏŞLƏNMƏK** *məch.* Küləşlə örtülmək, üstünə küləş salınmaq, küləş döşənmək. *Daxmanın damı küləşlənib.*

**KÜLƏŞLƏTMƏ** "Küləşlətmək"dən *f.is.*

**KÜLƏŞLƏTMƏK** *f.* Üstünü küləşlə örtdürmək, üstünə küləş saldırmaq (döşətmək). *Damı küləşlətmək.*

**KÜLƏŞLİ** *sif.* 1. Küləşi olan. *Hətəm dayı .. küləşli taxıl yerlərinə baxırdı.* Mir Cəlal.

2. Küləşlə örtülmüş, küləş qoyulmuş yaxud küləşlə doldurulmuş. *Küləşli çardaq. – Çaydan sonra yatışdıq. Mən də qeyri dustaqlar tək içi küləşli döşək üstə uzandım.* C.Məmmədquluzadə. [Qaradonlu:] *Gecəni bax, o üstü küləşli evdə qalıbmış.* İ.Hüseynov.

**KÜLƏŞLİK** *is.* Küləş olan yer, küləş, tökülmüş yer; kövşənlik. *Biçilmiş tarlaların küləşliyindən bildirçinlərin .. səsləri gəlirdi.* S.S.Axundov.

**KÜLFƏ** *is.* İşıq düşmək üçün tikilinin (əsasən, dəyənin) damında baca, işıq yeri; işıqlıq.

**KÜLFƏT** *is.* [*ər.*] 1. B a x **ailə** 1-ci mənada. *Bir külfətdə dörd nəfər uşaq var..* C.Məmmədquluzadə. [Qafar:] *Pinəçilik edib yeddi baş külfətin ruzisini bir tövr ilə qazanıram.* S.S.Axundov. [Molla Qurban:] *Bəy yanında alnıaçıq, külfət yanında üzügülər olasan, inşallah!..* Ə.Vəliyev. ☐ **Külfət sahibi** – ailə başçısı, ata. *İndi balaca uşaq özünü kişi və külfət sahibi hiss edirdi.* Ə.Haqverdiyev. *Nəcibənin .. oğlu iyirmi-iyirmi beş il idi ki, kənddə evlənmiş, külfət sahibi olmuşdu.* Mir Cəlal.

2. *köhn. evf.* Arvad mənasında. [Qəribin anası:] *Mən Təbrizli Məmmədin külfətiyəm, bu da oğlumun nişanlısıbır.* "Aşıq Qərib". [Cahan:] *Bəy, dəllal Kərbəlayı Nəsirin külfətiyəm, bəlkə tanıyasan?* Ü.Hacıbəyov. *Namaz kişinin külfətiyəm, – deyə, qarı könülsüz cavab verdi.* M.Hüseyn.

3. *məc.* Zəhmət, əziyyət, qayğı mənasında. *Onu külfət basıb.*

**KÜLFƏTARASI** *sif.* Ailə daxilində baş verən, ailədə olan. *Külfətarası söhbət.*

**KÜLFƏTLİ** *sif.* Külfəti olan, arvad-uşağı olan; ailəli. *Külfətli adam.*

**KÜLFƏTLİKLƏ** *zərf* Bütün ailə birlikdə, bütün külfət bir yerdə; ailəliklə. *Külfətliklə gəzməyə getmək.*

**KÜLFƏTSİZ** *sif.* Külfəti, ailəsi olmayan, arvad-uşağı olmayan, evli olmayan; ailəsiz.

**KÜLFƏTSİZLİK** *is.* Külfəti, ailəsi, arvad-uşağı olmama; külfəti olmayan adamın halı.

**KÜLXAN** *is.* [*fars.*] *köhn.* 1. Odunla qızdırılan hamamın odluğu, ocağı. *Külxanı təmizləmək. – Bir yetim tifildi baldırı açıq, başı keçəl; Mənzili şamü-səhər köhnə hamam külxanı.* S.Ə.Şirvani.

2. B a x **külxançı.** *Mənim üçün xan da birdir, külxan da.* (Ata. sözü).

**KÜLXANA** [*fars.*] b a x **külxan** 1-ci mənada. *Ata-ana sözünə baxmayan külxanada yatar.* (Ata. sözü).

**KÜLXANAÇI** b a x **külxançı.** *Yaşıllaşmaqda olan düzlükdən ara-sıra ötən qatarlar tüstülü kösöv gəzdirən külxanaçılara bənzəyirdi.* Mir Cəlal.

**KÜLXANÇI,** *is. köhn.* Külxanada işləyən adam, hamam ocaqçısı.

**KÜL-KÜLFƏT** *top.* Ailə, külfət, ailə üzvləri (hamı bir yerdə). *Kül-külfəti bir yerə yığmaq. – Arvadlar .. sarı keçinin ağuza oxşayan sarı südündən bir kasa alıb aparar, evdə kül-külfət üskük-üskük bölüşüb tamsına-tamsına içərdi.* S.Rəhimov. [Hətəmov Qaraşa:] *Çıxaq yuxarı, görək kül-külfət nə haldadır?* B.Bayramov.

**KÜLQABI** *is.* Papiros külünü və kötüyünü tökmək üçün xüsusi qab. *Yusif papirosu axıra qədər sümürüb külqabıya atdı.* B.Bayramov. *Külqabı siqaret kötükləri ilə dolmuşdu.* İ.Hüseynov.

**KÜLL** [*ər.*] 1. Bütün, cümlə, cəmi; bütöv, tam halda; ümum, ümumiyyətlə. *Bir küll halında. – Bəli, biz burada Mozalan kəndinin xəstəliyi olan sümük azarından – yəni xəbərçiliyin hamısından yox, əsla küllisini yox, cüzisini yazmaq istərdik.* S.Rəhimov.

2. *köhn.* İzafət birləşmələrinin birinci tərəfində "bütün", "bütöv", "tam" mənasında; məs.: *külli-cahan, külli-dünya* (bütün dünya, bütün aləm), *külli-vilayət* (bütün vilayət, ölkə). *Nigar, Koroğlu yarısan; Bilsin külli-aləm səni.* "Koroğlu". *Rəngü-ruyu, cismi, taqəti, canı; Külli-varı gedən bəs ağlamazmı?* M.V.Vidadi. *Ey dünya, sən puçsan, yalansan, yalan; Külli-xalq canına salmısan talan.* Molla Cümə.

**KÜLLƏMƏ** 1. "Külləmək"dən *f.is.*

2. *sif.* Qaynar kül içərisində bişirilmiş. *Külləmə kartof.*

**KÜLLƏMƏK** *f.* 1. Kül tökmək, kül sərmək. *Ləkləri külləmək. Ağacların dibini külləmək.*

2. Lavaşı yandırmamaq üçün saca, hisdən qorumaq üçün qazana və s.-yə küllü palçıq yaxmaq, sürtmək. *Qazanı külləmək. – ..Ana saç külləyib ocaq qalayır, kətə bişirib içinə təzə yağ qoyur..* Ə.Vəliyev.

3. Küllə sürtmək, küllə təmizləmək. *Samovarı külləmək. Mis qazanları külləmək.*

**KÜLLƏNMƏ** "Küllənmək"dən *f.is.*

**KÜLLƏNMƏK** *məch.* 1. Üstünə kül tökülmək, külə batmaq, küllə dolmaq. *Xörək küllənmişdi.*

2. *qayıd.* Külə dönmək, kül olmaq. *Ocaqda kömür külləndi. – Kabab ocağının közü küllənməyə başladı.* Ə.Vəliyev. *Hamı dağılışdı. Ocaq səngiyib külləndi.* B.Bayramov.

3. *məc.* Avaralanmaq, boş-bekar gəzmək, vaxtını boş keçirmək, faydalı işlə məşğul olmamaq. [Cəfər:] *Biz yazıq da meyit içində, azarlı yanında illərlə küllənirik.* Çəmənzəminli. [Rüstəm kişi:] *Əə, Salman, burda niyə küllənirsən? – deyib səsləndi.* M.İbrahimov. *Haradasa otuz il küllənən feldşer beləsindən çox-çox şöhrətli sayılır..* B.Bayramov.

**KÜLLƏŞMƏ** "Külləşmək"dən *f.is.*

**KÜLLƏŞMƏK** *f.* Yanıb külə dönmək, yanıb kül olmaq. *Köz külləşdi.*

**KÜLLİ** *sif.* [*ər.*] Saysız-hesabsız, çoxlu, çox. *Külli zərər. Külli məbləğ. Külli miqdar. Külli qoşun.*

**KÜLLİYYAT** *is.* [*ər.*] Bir yazıçı və ya alimin çap edilmiş bütün əsərlərinin toplusu. *M.F.Axundzadənin külliyyatı.*

**KÜLLÜ** *sif.* 1. Külə bulaşmış, külə batmış, içində kül olan. *Küllü çörək.*

2. Tərkibində kül olan. *Bitkiləri küllü su ilə dezinfeksiya etmək.*

**KÜLLÜK** *is.* 1. Kül tökülən yer. *Toyuqlar küllükdə eşələnir. – Külü küllükdən götür.* (Ata. sözü). *Zibil təpə olsa, küllük dağ olmaz; Yel əsəndə alçaqlara endirər.* Aşıq Abbas. *Kəndin qırağındakı küllükdən keçib çayı adlamalı idik.* M.İbrahimov.

2. *məc.* Xarabalıq, xaraba yer. *Küllük eylədilər gülüstanlığı.* M.Rahim.

◊ **Köhnə küllükləri eşələmək** – unudulmuş, vaxtı ilə olmuş, yaddan çıxmış bir hadisəni, pis işi, nöqsanları xatırlamaq, yada sal-

maq. *Kim isə Hacının keçmişini qurdaladı, köhnə küllükləri eşələdi.* Mir Cəlal.

**KÜLMƏ**[1] *is. zool.* Siyənək fəsiləsindən yeyilən balıq.

**KÜLMƏ**[2] *is. məh.* Yaş baramanı sıxıb qurutmaq üçün çən.

**KÜLRƏNGİ** *sif.* Kül rəngində olan; boz.

**KÜLTƏMİZLƏYƏN** *sif. xüs.* Külü təmizləməyə xidmət edən. *Kömür tökülən baca, kültəmizləyən bacadan bir qədər hündürdə olur.*

**KÜLÜ** *sif.* 1. *k.t.* Bozumtul-ağ. *Külü torpaq.* 2. Kül rəngində olan, kül rənginə çalan; boz, külrəngi. *Külü parça. Külü corab.*

**KÜLÜNG** *is.* Daş çıxarma və torpaq qazıma işlərində istifadə edilən bir ucu sivri, o biri ucu isə enli alət. *Külünglə yer qazımaq. Külüngə dəstə vurmaq. – Əhməd .. bir külüng gətirib evin küncünə atdı.* Ə.Haqverdiyev. *Şahnisə xanımın döşəkçəsinin üstündə Fərhad külünglə dağı yarırdı.* Çəmənzəminli.

◊ **(Fərhad kimi) külüng vurmaq (çalmaq)** – zəhmət çəkmək, çalışmaq, işləmək, əziyyətə qatlaşmaq. [Hacı Murad:] *Qırx il külüng çalıb bir cüzi pul əlimə salmışam.* S.S.Axundov. [Mirzə Camal:] *Neçə ildir Fərhad kimi külüng vururam, bu səhnəni mən düzəltmişəm, indi o gəlib mənə dərs verəcəkdir!* C.Cabbarlı. [Şeyda:] *Gərək məhəbbəti fəaliyyətə çevirib, işıq və gözəllik uğrunda külüng çalasan!* Ə.Məmmədxanlı. **Külüng sındırmaq** – b a x **külüng vurmaq (çalmaq).** *Nahaq bu yolda külüng sındırır.* S.Rəhman.

**KÜLÜNGÇÜ** *is.* Külünglə işləyən, külüng işlədən, torpaq qazıyan fəhlə. *Külüngçülər başladılar minarənin dibini qazımağa.* "Koroğlu".

**KÜLÜNGLƏMƏ** "Külüngləmək"dən *f.is.*

**KÜLÜNGLƏMƏK** *f.* Külünglə qazımaq, külünglə əzmək (torpağı, kəsəyi və s.-ni). [Qadir] *..bir az o yanda torpaq qazıyanlara yaxınlaşıb yeri külüngləməyə başladı.* Ə.Əbülhəsən.

**KÜLÜNGLƏNMƏ** "Külünglənmək"dən *f.is.*

**KÜLÜNGLƏNMƏK** *məch.* Külünglə qazılmaq, külünglə əzilmək (torpaq, kəsək və s.). *Bağ külünglənmişdi.*

**KÜLÜF** *is.* Dağ, qaya dibində oyuq yer, balaca mağara. *Ay Pası, kafir çoxdan bizim yuxarı qayanın külüfündə yaşayır.* S.Rəhimov.

**KÜM** *is. dan.* Barama, barama qurdu.

**KÜMBƏD, KÜMBƏZ** b a x **künbəz.** *Bu fikirdə ikən gözümə bir kümbəd dəydi.* S.S.Axundov.

**KÜMBƏDLİ, KÜMBƏZLİ** b a x **künbəzli.** *Tamam üstü kümbədli bir köhnə məzar tapır və içində gizlənir.* S.S.Axundov.

**KÜMÇÜ** *məh.* b a x **baramaçı** 1-ci mənada. [Heydər bəy:] *Ərz elədim ki, naçalnik, heç vaxt Cavanşirdən kotançı və kümçü görünməyib.* M.F.Axundzadə.

**KÜMÇÜLÜK** b a x **baramaçılıq.** *Kümçülüklə məşğul olmaq.*

**KÜMDAR** b a x **kümçü.**

**KÜMDARLIQ** b a x **kümçülük.**

**KÜMXANA** *is.* Küm saxlamaq üçün qarğıdan, ağacdan və s.-dən düzəldilmiş qəfəsəli yer, tikili. *Kümxananı qaydaya salmaq.*

**KÜMÖYÜL** *is. zool.* Ağacları qurudan qurd, zərərverici cücü.

**KÜNC** *is.* [*fars.*] Bucaq, guşə. *Şkafın küncü. Küncə çəkilmək. – Arvad ələyi gətirəndən sonra Qurban oturdu otağın bir küncündə və başladı gəci ələməyə.* C.Məmmədquluzadə. *Məhbuslar qorxularından küncə qısılırlar.* Ü.Hacıbəyov. *Qalaca küncünə qısılan şahın; Xalqı palçıq kimi tapdalanıbdı.* M.Araz. // Məc. mənada. *..Meşənin dərin küncündə cəh-cəh ilə oxuyan bülbüllərə qulaq verdim.* A.Divanbəyoğlu. *Atıb anan səni bir qəmli küncə; Sənə süd verərdi sanki ödüncə..* M.Müşfiq.

**KÜNC-BUCAQ** *is.* 1. B a x **künc.** *Otağın fərşi çoxdan bəri süpürülməmişdi: künc-bucağı, tavanı hörümçək toru basmışdı.* M.S.Ordubadi. [Xalıqverdi:] *Mitillərimin hamısını söküb, küncü-bucağı qazıq-qazıq eləyibsiniz.* Ə.Vəliyev.

2. *məc.* Gizlin, nəzərə çarpmayan, xəlvət, dalda yer mənasında. *Künc-bucağı axtarmaq. Küncdə-bucaqda gizlənmək.* – [Hümmət:] *Küncdə-bucaqda danışmaq arvad işidir, – deyə, astadan gileylənə-gileylənə eyvana çıxdı.* B.Bayramov.

**KÜNCLÜ** *sif.* Küncü, tini olan.

**KÜNCÜD** *is.* 1. Tumundan yağ alınan ağ rəngli çiçəkləri olan birillik bitki. *Küncüd çiçəkləmişdir.*

2. Bu bitkinin toxumu (çörəyin üstünə səpilir, tibdə işlədilir). *Solmaz küncüddən tutmuş qarpız tumuna qədər əlinə nə düşsə, Patrona yedizdirərdi.* İ.Məlikzadə. ☐ **Küncüd yağı** – küncüddən alınan bitki yağı. **Küncüd halvası** – küncüddən hazırlanan halva növü.

**KÜNCÜDLÜ** *sif.* Küncüd vurulmuş, küncüd qatılmış, tərkibində küncüd olan. *Küncüdlü halva. Küncüdlü çörək. – ..Kimi ayaq üstə durub ağzına küncüdlü qovurğa atır.* Ə.Abasov.

**KÜNDƏ**[1] *is.* 1. Sonradan yaymaq, yastılamaq üçün yumru hala salınmış xəmir parçası. *Bir kündə xəmir. Kündələri tabağa yığmaq. – Atam elə bicdir ki, kündəni sayır, anam elə bicdir ki, kündədən kəsir.* (Məsəl). *Gülsənəm son kündəni də .. sacın üstünə sərdi.* S.Rəhimov. *Pəri nənə səy və diqqətlə iri kündəni yayırdı.* M.Hüseyn.

2. *məc.* Qalın, kobud, kələ-kötür. [Mürsəl:] *Ayaqların kündə, əllərin kösöy; Gəlin gedən kimi qaynananı döy!* S.Rüstəm. // Sif. mənasında. *Kündə əl. Kündə ayaq.*

**KÜNDƏ**[2] *is.* [*fars.*] Keçmişdə: qaçmasın deyə dustaqların ayaqlarına, boyunlarına və ya əllərinə vurulan ağır şey. *Mən aşiqəm tey yara; Canım aldı tey yara; Boynum kündədə olsun; Əlim yetsin tey yara.* (Bayatı). *Xəlil paşa hökm elədi, üçünün də ayağına kündə vurub zindana salsınlar.* "Koroğlu". *Həcərin ayağına qandal, boynuna kündə vurdular.* "Qaçaq Nəbi".

**KÜNDƏAÇAN** *is.* Kündəni yaymaq üçün alət.

**KÜNDƏLƏMƏ** "Kündələmək"dən *f.is.*

**KÜNDƏLƏMƏK** *f.* Xəmirdən kündə hazırlamaq, kündə qayırmaq, kündə tutmaq. *O, süfrə qabağında oturub xəmir kündələyirdi.* S.Rəhimov.

**KÜNDƏLƏNMƏ** "Kündələnmək"dən *f.is.*

**KÜNDƏLƏNMƏK** *məch.* Xəmirdən kündə hazırlanmaq, kündə qayrılmaq, kündə tutulmaq. *Xəmir kündələndi.*

**KÜNDƏLİ** *sif.* Ayağına və ya boynuna kündə vurulmuş (b a x **kündə**[2]). *Ayağı kündəli dustaq.*

**KÜNDƏLİK** *is.* Saylarla işlənərək, xəmirdən tutulacaq kündənin miqdarını bildirir. *On kündəlik xəmir yoğurmaq.*

**KÜNDÜR** *is.* [*fars.*] Saqqız ağacının qabığından hazırlanan xoşiyli sarımtıl maddə. *Yazılmış uca məzar daşlarının dibindən çıxan səndəl və kündür tüstüləri qızların nəzərini cəlb edirdi.* M.S.Ordubadi.

**KÜNƏ** *is.* Yumurtanın enli (küt) tərəfi. *..Əli yumurtasının künəsini tutur və deyir..* C.Məmmədquluzadə.

**KÜNFƏYƏKÜN** [*ər.*]: **künfəyəkün etdirmək** – alt-üst etdirmək, darmadağın etdirmək. [Məstəli şah:] *Xanım, buyurursunuzmu Pariji künfəyəkün etdirim, altını üstünə çevirtdirim.* M.F.Axundzadə. **Künfəyəkün etmək** – alt-üst etmək, darmadağın etmək. [Məşədi:] *..And olsun oğlumun canına, ayda manat bir şahıdan artıq müamilə almamışam. Artıq almışamsa, Allah mənim evim künfəyəkün eyləsin..* Ə.Haqverdiyev. **Künfəyəkün olmaq** – alt-üst olmaq, darmadağın olmaq; məhv olmaq, dağılmaq. *Qərəz, ailə bir neçə ilin içində künfəyəkün oldu.* S.Rəhman.

**KÜNG** *is. köhn.* Saxsı boru (su kəməri və ya kanalizasiya üçün).

**KÜNH** *is.* [*ər.*] *klas.* Bir şeyin əsli, mahiyyəti, əsası, məğzi. *Adəmin künhünü anlardı, qılardı səcdə.* S.Ə.Şirvani. *Çatdı ya ki, uşaqların; Künhünə elmü sənətin? Yaxşı ki, qorxub az yedin; Toxluq edər təbiətin.* A.Səhhət. ☐ **Künhünə varmaq (çatmaq)** – bir şeyin əsasını, əslini, mahiyyətini, məğzini öyrənmək, araşdırmaq, bilməyə çalışmaq. *Məsələnin* (*işin*) *künhünə çatmaq.*

**KÜNYƏ** *is.* [*ər.*] Bir şəxsin adı, əslinəsəbi və s. kimi xüsusiyyətlərini göstərən qeyd (adətən ərəb dilində "əbu", "ibn", "ümm" sözləri ilə başlanan ləqəb). *Çün Nəsiminin Əbülfəzl oldu həqdən künyəsi.* Nəsimi.

**KÜP** *is.* Kürədə bişmiş sarı palçıqdan, gildən qayrılan iri saxsı qab. *Su küpü. Bir küp sirkə. Küpü doldurmaq. – Mənim rəhmətlik dədəm burada yeddi küp qızıl basdırıb.* "M.N.lətif". *Pusqu üçün girdi küpün dalına; Çəkdi əlin bığına, saqqalına.* S.Ə.Şirvani. *Çoban məşəlin yanındakı iri küpdən bir parça* [neft] *götürüb məşələ atdı.* M.Rzaquluzadə. ☐ **Küp qəbri** *tar.* – çox qədimlərdə ölülərin basdırıldığı və indi qazıntı halında tapılan küpə – qəbir.

◊ **Küp dibində yatan** – daim sərxoş halda olan adam haqqında. **Küp dibində yatmaq** – həddindən çox içmək, həmişə sərxoş olmaq, sərxoşluq etmək. [İskəndər:] ..*Cəlal, ay Cəlal! Sən də mənim kimi dərs oxuyub qurtarandan sonra, başlayacaqsan İskəndər dadaşın kimi küp dibində yatmağa.* C.Məmmədquluzadə. **Küp qarısı** – b a x **küpəgirən.** *Daha pünhan qala bilməz nə xeyir, nə şər əməli; Küdurətin küp qarısı gələ bilməz kələk bizə.* Şəhriyar. **Küpünə girmək (çaxırın və s. içkinin)** – həddindən artıq içmək (şərab və b. içki). [Məşədi Səfərqulu:] *Sən öləsən, şərabın küpünə girir.* S.S.Axundov. **Küpünü yum!** – ağzını yum! sus!

**KÜP**[2] *is.* 1. B a x **dibcik.** *Tüfəngin küpilə vurub boynuna; Əl salıb cibinə, həmi qoynuna...* H.K.Sanılı. [Gödək kişi] *tüfəngin küpünü yerə qoydu, sağ əlini* [Qədirə] *verdi.* Mir Cəlal. *Əsgər əlini tüfəngin küpünə vurdu.* Ə.Əbülhəsən. // Keçmişdə ağızdan, dolma tüfənglərdə və tapançalarda lülə ilə çaxmağın arasında piston qoyulan yer. [Ovçu] *çaxmağı qaldırıb gördü ki, küpündə piston da var.* M.Rzaquluzadə.

2. Baltanın sapı keçirilən yerin arxa hissəsi. *Baltanın küpü ilə vurmaq.*

3. Xəncər və s. kimi kəsərtilərin əllə tutulan hissəsi, dəstəsi, qəbzəsi.

4. Buxovun açarla açılıb-bağlanan hissəsi. *Buxovun küpü.*

**KÜPÇƏ** *is.* Balaca küp, kürəcik. *O qədər küp üstə küpçələr sınıb.* (Ata. sözü).

**KÜPÇÜ** *is.* İp və s. boyayan adam; boyaqçı.

**KÜPÇÜLÜK** *is.* Küpçünün işi, sənəti, peşəsi; boyaqçılıq.

**KÜPƏ**[1] *is.* Su, yağ və s. tökülən müxtəlif ölçülü saxsı qab. *Yağı küpələrə doldurmaq. Küpənin ağzını bağlamaq. Küpəyə doşab tökmək. – Saat yarımdan sonra Qurban gəldi. Küpəni, ləyəni, parçı və bir lüləyin gətirdi.* C.Məmmədquluzadə. [Səlimə:] *Küpənin dibində bir az gərək turşu olsun.* Ə.Haqverdiyev. [Sadıq] *içi kərə yağla dolu şirli küpəni döşəməyə qoydu.* Mir Cəlal. □ **Küpə qoymaq (salmaq)** – soyuq dəymiş adamın dalına balaca küpə (banka) qoymaq (salmaq). [Günəş:] *Səni soyuq almış, gəl belinə küpə qoyum, – dedi.* A.Şaiq. [Mələk:] *Bu saat penisillin vuracağam, küpə salıb, üstünü basdıracağam.* M.İbrahimov.

**KÜPƏ**[2] *is. dan.* Tumurcuq. *Ağacın küpəsinə baxmaq.*

**KÜPƏCİK** b a x **küpçə.**

**KÜPƏÇİÇƏYİ** *is. bot.* Parlaq, çox vaxt qırmızı çiçəkləri olan dekorativ kol-bitki.

**KÜPƏGİRƏN: küpəgirən qarı** *folk.* – hiylə, biclik, fırıldaq, ara vurmaq kimi işlərlə məşğul olan qarı (nağıllarda mənfi surət kimi işlənir). [Həkimbaşı:] *Gör bir küpəgirən qarı tapa bilərsənmi?* Ə.Haqverdiyev. *Kənardan küpəgirən, işsiz, peşəsiz, avam və cahil qarılar meydanı daha da qızışdırardılar.* H.Sarabski.

**KÜPƏLƏMƏ** "Küpələmək"dən *f.is.*

**KÜPƏLƏMƏK** *f.* Küpə qoymaq, küpə salmaq; bankalamaq. *Xəstəni küpələmək.*

**KÜPƏLƏNMƏ** "Küpələnmək"dən *f.is.*

**KÜPƏLƏNMƏK** *məch.* Küpə qoyulmaq, küpə salınmaq; bankalanmaq.

**KÜPƏLƏTDİRMƏK** b a x **küpələtmək.**

**KÜPƏLƏTMƏ** "Küpələtmək"dən *f.is.*

**KÜPƏLƏTMƏK** *icb.* Küpə qoydurmaq, küpə saldırmaq; bankalatdırmaq.

**KÜPƏMƏ** "Küpəmək"dən *f.is.*

**KÜPƏMƏK** *f. dan.* 1. B a x **gopamaq** 1-ci mənada. *Qız almanı küpədi* [Məlik Cümşüdün] *dalınca.* (Nağıl).

2. Acgözlüklə yemək, aşırmaq, tıxmaq, ötürmək. *Xörəyi küpəmək.*

**KÜPSƏMƏ** "Kürsəmək"dən *f.is.*

**KÜPSƏMƏK** b a x **küpəmək** 1-ci mənada. *Ağca xanım keçib uşağın qolundan tutdu, murdar bir pişik balası kimi çıxarıb eyvana qoydu, kürəyinə də bir yumruq küpsədi.* Mir Cəlal.

**KÜR**[1] *sif.* 1. Ağlağan, qışqırıqçı, şıltaq. *Kür uşaq.*

2. Hay-küyçü, zorakı, dediyini yeridən, inadkar. *Kür adam.* – [Əlyarov:] *Sonra ağzıgöyçəklər deyəcəklər ki, Əlyarov kürdür, heç kəslə yola gedən deyil.* M.Hüseyn.

3. Tənbəl, bacarıqsız, aciz, əlindən iş gəlməyən. // İs. mənasında. *Kür günortayacan nə eyləyib ki, günortadan sonra nə eyləsin?* (Ata. sözü).

**KÜR**[2] *sif.* Pak, təmiz (su haqqında). *Hovuz kürdür.*

**KÜRD** *is.* Azərbaycan, Türkmənistan, Suriya, İraq, İran, Türkiyə, Əfqanıstan və Pakistanda yaşayan irandilli xalq və bu xalqa mənsub adam. *Əsli kürd olan bu adamın ağası Alıkişi qapılarda muzdurluq etməklə böyük ailəsini saxlayırmış.* "Qaçaq Nəbi". [Qaçay:] *Kürdün kürdə sovqatı, bir dəstə bulaq otu, – deyiblər.* Ə.Vəliyev.

◊ **Kürd-ovşarı, kürd-şahnaz** və s. – klassik Azərbaycan musiqisində muğam adları.

**KÜRDİ** *is. mus.* Əsasən kamançada ifa olunan lirik musiqi.

**KÜRDOĞLU** *is. mus.* Aşıq musiqi formalarından biri.

**KÜRDÜ** b a x **küləcə**.

**KÜRDÜNAĞIRI** *is. mus.* Yallı tərzində oyun havası. *Kürdünağırı çalmaq.*

**KÜRDCƏ** *zərf* və *sif.* Kürd dilində. *Kürdcə-azərbaycanca lüğət. Kürdcə danışmaq.*

**KÜRƏ[1]** *is.* [*ər.* kürrə] Yer kürəsi, üzərində sakin olduğumuz planet. *Yer kürəsinin əhalisi. Geri fırlan, Yer kürəsi, zamandan küsüb; Nüşabənin kəcavəsi təpədən aşdı...* M.Araz. ☐ **Küreyi-ərz** *köhn.* – Yer kürəsi, dünya. *Bu küreyi-ərzdə mən, müxtəsər; Müxtəlif əlvan görürəm, qorxmuram.* M.Ə.Sabir. // Şar, yuvarlaq şey. *Küçələrdə sıra ilə yerə basdırılmış çuqun dirəklərin başında ağ kürələr parlayırdı.* Ə.Sadıq.

**KÜRƏ[2]** *is.* [*fars.*] 1. Dəmiri qızdırmaq üçün körüklə odu közərdilən dəmirçi ocağı. *Kürəni körükləmək. Dəmirçi kürəsi. – Dəmiri kürədən dəmir çıxardar.* (Ata. sözü). *Əlli qədəm bir-birindən aralı çadırların aşağı tərəfində ağacdan bir çardaq tikilib, içində böyük misgər kürəsi və bu kürəyə münasib bir körük nəsb olub.* M.F.Axundzadə. *..Körüklər basılır, kürə qızarır, zindan səslənir.* S.Rəhimov. ☐ **Cəhənnəm kürəsi** – b a x **cəhənnəm.** *Yayda cəhənnəm kürəsi kimi hər tərəfi yandıran Tehran günəşi, payızın son ayları və qışda çox ılıq və mülayim olur.* M.İbrahimov.

2. Palçıqdan, gildən və ya dəmirdən düzəldilən kiçik ocaq. *Xörəyi kürədə bişirmək. Kürəyə kömür tökmək. – Mətbəxdə mütləq təndir, biri böyük, digəri kiçik iki ocaq, bir kürə olardı.* H.Sarabski. *..Fatma səkidə, palçıqdan qoyulmuş kürədə südlü sıyıq bişirirdi.* Ə.Əbülhəsən.

**KÜRƏ[3]** *is.* Qulaqları uzun (qoyun haqqında). *Qoyun var kərə gəzər; Qoyun var kürə gəzər; Gedər, dağları gəzər; Gələr, evləri bəzər.* (Sayaçı sözü). // Sif. mənasında. *Kürə qoyun.*

**KÜRƏCİK** *is.* 1. Balaca kürə, kiçik kürə; dairəcik. *İki dozanqurdu mal təzəyini yumurlayıb aparırdı. Onlar başıaşağı durub, dal ayaqları ilə kürəciyi dığırlayırdılar.* İ.Şıxlı.

2. *fiziol.* Qanın tərkib hissəsi. ☐ **Qırmızı, ağ qan kürəcikləri** – qanın tərkib hissəsi, qanın ən xırda hissəcikləri.

**KÜRƏÇİ** *is.* Kürəyə xidmət edən adam; ocaqçı yaxud kürədə kərpic, qab və s. bişirməklə məşğul olan adam.

**KÜRƏÇİLİK** *is.* Kürəçinin işi, peşəsi; ocaqçılıq. *Kürəçilik eləmək.*

**KÜRƏXANA** *is.* [*fars.*] *köhn.* 1. Gildən, palçıqdan hazırlanan şeylərin (məs.: saxsı qab, kərpic və s.) bişirildiyi yer.

2. Çörəkxanalarda kürələr (peçlər) olan yer; ocaqxana. *Məşədi Hüseyn qoluçirməkli, döşüönlüklü xəmirxanadan kürəxanaya keçir, dayanmadan geri qayıdırdı.* Mir Cəlal.

3. Dəmirçi, misgər, qalayçı dükanlarındakı kürə, odluq. *Misgər kürəxanasından çıxan mis məcməyi kimi qızaran günəş dağ arxasından yavaş-yavaş boylanırdı.* P.Makulu.

**KÜRƏK[1]** *is.* 1. Bədənin arxa hissəsinin yuxarısında olan üçkünc şəkilli yastı sümüklərdən hər biri. [Qəhrəman:] *Güllə arxasından, kürəkləri arasından dəyib keçmişdi.* H.Nəzərli. // İnsan bədəninin həmin hissəsi. *Kürəyini divara söykəmək. Kürəyini ovuşdurmaq. –* [At] *Kərbəlayı Qasımın dalınca gedə-gedə hərdən alnını sürtürdü Kərbəlayı Qasımın kürəyinə.* C.Məmmədquluzadə. *..Ağsaqqal həkim yuxarıdan əlini Əlisanın kürəyinə vurdu.* S.Rəhimov.

2. Paltarın kürəyi örtən hissəsi. *Pencəyin kürəyinə astar tikmək. Paltarın kürəyi dağılmışdır.*

◊ **Kürək cəzası** *köhn.* – b a x **katorqa. Kürək çevirmək** – dal çevirmək, üz döndərmək. **Atasını kürəyinə (dalına) sarımaq (yükləmək)** – b a x **atasını dalına sarımaq** ("**ata**"da). **Kürək-kürəyə vermək** – bir-birinə arxalanmaq, kömək etmək, əl-ələ vermək. *Məsciddəki camaat soyuqdan titrəşirdi.. Soyuqdan donmamaq üçün ayaqlarını*

*yerə döyür, kürək-kürəyə verib bir təhər qızışırdılar.* İ.Şıxlı. **Kürəyi yerə gəlmək** – basılmaq, məğlub olmaq. [Kərəmzadə:] *Sənin qohumuna bel bağlayanın bərkə düşən kimi, kürəyi yerə gələr, Nisə!* B.Bayramov. **Kürəyindən çıxartmaq** – əvəz almaq, acığını çıxmaq. **Kürəyini yerə vurmaq (qoymaq)** – 1) basmaq, məğlub etmək; 2) taqətsiz yıxılmaq, bihuş düşmək, düşüb qalmaq. *Uca bir dağ ətəyində; İnsan birdən ürəyində; Amansız bir ağrı duydu; Kürəyini yerə qoydu.* M.Dilbazi. **Kürəyini... söykəmək** – arxayın olmaq, bel bağlamaq. *Kürəyini dağa söykəyib.*

**KÜRƏK**[2] *is.* 1. Torpaq və s. atmaq üçün ağacdan qayrılmış uzundəstəkli alət. *Kürəklə qar atmaq. Samanı kürəklə yığmaq. – Həyatin sol tərəfində Vəliqulu əynində cındır gödək arxalıq və başında köhnə boz papaq kürəklə peyin sərirdi.* C.Məmmədquluzadə. *İndi bəyin əli xəncər dəstəsindən deyil, süpürgə və kürək dəstəsindən yapışmış, bazar süpürürdü.* H.Nəzərli.

2. B a x **avar**[1]**.** *Kürək çəkmək. – Dürrə .. kürəkləri tez-tez tərpədərək sürətlə irəliləməyə başladı.* S.Vəliyev.

◊ **Kürəklə ağzına vurmaq** – b a x **ağzından vurmaq** ("**ağız**"da).

**KÜRƏKAYAQLILAR** *cəm zool.* Suda üzmək üçün ayaqları kürək şəklində olan məməli heyvanlar dəstəsi. *Balinalar kürəkayaqlılara nisbətən su ilə daha çox əlaqədardır.* "Zoologiya".

**KÜRƏKCİK** *is.* Balaca kürək, kiçik kürək (b a x **kürək**[2]). *Kürəkciklə işləmək.*

**KÜRƏKÇİ** b a x **avarçı**.

**KÜRƏKƏN** *is.* Qızın ərinin, qızın ata və anasına olan qohumluq münasibəti; yeznə. [İmran:] *Hacı Murad, sən çox xoşbəxtsən ki, İmran kimi kürəkənin var.* S.S.Axundov. *Yaxşı yol, oğlum! – deyərək, qoca qayınana öz cavan kürəkənini yola saldı.* B.Talıblı. [Vahimə:] *Bacım da durdu, durdu, özünə kürəkən tapdı.* B.Bayramov.

**KÜRƏKƏNLİK** *is.* Kürəkənin öz arvadının ata-anasına olan qohumluq vəziyyəti.

**KÜRƏKLƏMƏ** "Kürəkləmək"dən *f.is.*

**KÜRƏKLƏMƏK** *f.* 1. Kürəklə atmaq, təmizləmək; kürümək. *Qarı kürəkləmək. Buğdanı kürəkləmək. – Mühəndis qumu bir xeyli kürəklədi..* Mir Cəlal.

2. Kürək (avar) çəkmək, avarlamaq. *Qayığı kürəkləmək.*

**KÜRƏKLƏNMƏ** "Kürəklənmək"dən *f.is.*

**KÜRƏKLƏNMƏK** *məch.* 1. Kürəklə təmizlənmək, atılmaq; kürünmək. *Tövlə kürəkləndi.*

2. Kürək çəkilmək, avarlanmaq. *Qayıq kürəkləndikcə irəliləyirdi.*

**KÜRƏKLƏTMƏ** "Kürəklətmək"dən *f.is.*

**KÜRƏKLƏTMƏK** *icb.* 1. Kürəklə atdırmaq, təmizlətmək; kürütdürmək. *Qarı kürəklətmək.*

2. Kürək çəkdirmək, avarlatmaq. *Qayığı kürəklətmək.*

**KÜRƏKLİ**[1] *sif.* Enli kürəkləri olan, enlikürəkli. *Kürəkli oğlan* (*kişi*).

**KÜRƏKLİ**[2] *sif.* Əlində kürək olan. *..Bir neçə yerdə əli belli və kürəkli kişilər uçuq damların daşını və torpağını sökməkdə idilər.* C.Məmmədquluzadə *..Bunkerin qabağında, maşında taxılı boşaltmaq üçün əli kürəkli iki arvad dayanmışdı.* Ə.Əbülhəsən. *Belli, dəhrəli, yabalı, külünglü, kürəkli adamlar bir-birinə qarışmışdılar.* Ə.Vəliyev.

**KÜRƏKLİK** *is.* və *sif.* Kürək qayırmağa yarar, kürək qayırmaq üçün (ağac və s.). *Kürəklik ağac. – Sən gördüyün ağaclar kürəkliyə kəsildi.* (Ata. sözü). *Gəldi, gördü ki, bu həyət daha o həyət deyil, gördüyü ağaclar kürəkliyə kəsilmişdir.* Mir Cəlal.

**KÜRƏLƏMƏ** "Kürələmək"dən *f.is.*

**KÜRƏLƏMƏK** b a x **kürümək** 1-ci mənada.

**KÜRƏMƏ** "Kürəmək"dən *f.is.*

**KÜRƏMƏK** b a x **kürümək.**

**KÜRƏN** *sif.* Saçı, tükü parıltılı sarı-qırmızı rəngdə olan. *Kürən oğlan. – Kürən at, geriyə dön! – dedikdə, kürən at dərhal geriyə sıçradı.* M.S.Ordubadi. // *İs. mənasında.* Bu rəngdə saçı, tükü olan at, adam və s. *Kürəni minmək. Kürəni çapmaq. – Üfüqlərdə günəş; Alov yallı bir kürən.* R.Rza.

**KÜRƏNMƏ** "Kürənmək"dən *f.is.*

**KÜRƏNMƏK** b a x **kürünmək.** *Tövlə kürənib qurtardı.*

**KÜRƏNVARİ** *sif.* Kürən rəngində, kürənə bənzər; sarı-qırmızı.

**KÜRƏŞƏKİLLİ** *sif.* Kürə (şar) şəklində olan; kürəvari, kürəvi.

**KÜRƏVARİ** b a x **kürəvi.**

**KÜRƏVARILIQ** b a x **kürəvilik.**

**KÜRƏVİ** *sif.* [*ər.*] Kürə (şar) şəklində, kürəyəoxşar, şar şəklində, kürəvari, kürəşəkilli, girdə. *Kürəvi cisim.*

**KÜRƏVİLİK** *is.* Kürə şəklində olma, şara oxşama; girdəlik, kürəşəkillilik, kürəvarilik.

**KÜRƏYƏC** *is.* b a x **kürək**[2] 1-ci mənada. *Kürəyəclə zibili bir yerə yığmaq.*

**KÜRK** *is.* 1. Keçmişdə, əsasən, qoyun dərisindən, indi isə süni tüklü dərilərdən tikilən yaxud içi ya üzü bu kimi dəri ilə örtülü olan isti qış geyimi. *Kürk tikmək. Kürkü geymək. – Telli .. Rizvanın da kürkünü Gülpərinin çiyninə salırdı.* S.Hüseyn. *Soyuq bir cəhənnəm, bir yaman ölkə; Soyuq güc gətirdi, sığındım kürkə.* Ə.Cavad. *Balkanlılar tərsinə geydi köhnə kürklərin; Qorxutmağa durdular Avropanın türklərin..* A.Səhhət. // Qiymətli xəzdən tikilmiş qadın, uşaq isti üst geyimi. *Dovşan dərisindən kürk. – Yumşaq tükdən boz kürkümə; Anam büküb bu yaz məni.* M.Dilbazi.

2. *Məc. mənada.* Örtük, pərdə. *Dağlar ağ kürkə bürünmüşdü. – Siyasi dumanların kəsif kürkünə girib .. nəşələr dünyasında üzən bu şəhər* [Bağdad] *minlərcə .. xəfiyyələrin əlində idi.* M.S.Ordubadi.

◊ **Kürkünə birə dolmaq (düşmək)** – təşvişə düşmək, əl-ayağa düşmək, həyəcan keçirmək, narahat olmaq. *Bu son aylar nədənsə Nemətullayevin kürkünə birə dolmuşdu.* S.Rəhimov. **Kürkünə birə salmaq** – birini təşvişə salmaq, qorxuya salmaq, bir şeylə qorxudaraq narahat vəziyyətə salmaq. *Bağır bayaqdan bəri qonşusunun atmacalarını vecinə almırdı, amma Piti Namazın indi dedikləri kişinin kürkünə birə saldı.* İ.Məlikzadə. **Kürkünü sudan çıxarmaq** – çətin vəziyyətdən özünü çıxara bilmək (çıxarmaq), öz işini düzəltməyi bacarmaq.

**KÜRKÇÜ** *is.* 1. Kürktikən usta; kürk tikib satmaqla məşğul olan adam. *Kürkçünün kürkü olmaz, börkçünün börkü.* (Ata. sözü).

2. Yaxşı dəri, xəz tanıyan adam; dəri, xəz mütəxəssisi.

**KÜRKÇÜLÜK** *is.* Kürkçünün işi, peşəsi, sənəti. *Kürkçülüklə məşğul olmaq.*

**KÜRKLÜ** *sif.* Əynində kürk olan, kürk geymiş. *Kürklü qoca. – Kürklü arabaçı əlini gözünün üstünə qoyub baxdı, ancaq bir şey görmədi.* S.Rəhimov. *Qalın kürklü, çiyni tüfəngli qoca sağ böyründən əleyhqaz asmışdı.* Ə.Əbülhəsən.

**KÜRKLÜK** *is.* 1. Kürk tikilməyə yarar. *Kürklük dəri, xəz.*

2. Rəqəmlərlə – rəqəmin göstərdiyi miqdarda kürk tikməyə kifayət edəcək qədər. *İki kürklük dəri.*

**KÜRKTİKƏN** b a x **kürkçü** 1-ci mənada.

**KÜRLƏŞMƏ** "Kürləşmək"dən *f.is.*

**KÜRLƏŞMƏK** *f.* 1. Getdikcə ağlağan, qışqırıqçı, şıltaq olmaq (uşaq haqqında). *Aylar keçdikcə körpə kürləşir, ağlamaqdan yorulmur, Firəngizin yuxusu isə göyə çəkilirdi.* S.Rəhimov.

2. Tənbəlləşmək, tənbəl olub getmək, vaxtını boş-boş keçirmək.

**KÜRLÜK** *is.* 1. Ağlağanlıq, şıltaqlıq, qışqırıqçılıq (uşaq haqqında). *Uşaq kürlükdən arıqladı.*

2. Tənbəllik, bacarıqsızlıq, acizlik. *Kürlük etmək.*

**KÜRNƏC** *is. məh.* Bir yerə toplanma, yığışma, topa halında dayanma (qoyun və s. haqqında). [Pası] *..qoyunların kürnəcdə çox dayanmasına yol verməzdi.* S.Rəhimov. **Kürnəc bağlamaq** – bir yerə toplanmaq, yığılmaq, sıx dayanmaq (qoyun və s. haqqında). *Gün getdikcə yağlanır, qoyun kürnəc bağlayır, köç dəhmərlənib gedirdi.* Ə.Vəliyev.

**KÜRRƏ** *klas.* b a x **kürə**[1]. *İllər olub – kürrələrdə dəmir olmuşuq; Sərhədlərdə dayanmışıq küləkdən ayıq.* M.Araz.

**KÜRSƏK** *is.* İtlərin, canavarların və bəzi başqa vəhşi heyvanların cütləşməsi, cinsi əlaqə prosesi və bu prosesin dövrü.

**KÜRSÜ** *is.* [*ər.*] 1. Yanları və söykənəcəyi olmayan stul; kətil. *Kürsüdə oturmaq. – Xəstənin yanındakı kürsünün üstündə oturan mülayim bir həkim fısıltı ilə danışırdı.* H.Nəzərli. *Dünən əl çalındı bir sənətkara; Bir kürsü qulunun rəngi dəyişdi.* M.Araz. // Kreslo, stul. *Kürsüləri düzmək. – Otağa xalılar salınıb və yumşaq divan və kürsülər qoyulub.* Ə.Haqverdiyev. *Ziyafət məclisinin yuxarı başında üç boş kürsü qoyulmuşdu.* M.S.Ordubadi.

2. Tribuna, kafedra. *Kürsüdən danışmaq. – Salona daxil olduqda Sona xalanı kürsüdə nitq söyləyən gördüm.* S.S.Axundov. *Yoğunca bir adam olan Mehman dayı yerindən qalxıb kürsünün dalına gəldi.* Ə.Sadıq. ☐ **Kürsüyə çıxmaq** – nitq demək, çıxış etmək və s. üçün tribunanın arxasına keçmək. *Natiq kürsüyə çıxdı. – Mən də çıxdım kürsülərə, mən də söyüldüm, söydüm.* S.Rüstəm. *Natiqlər bir-birinin arxasınca kürsüyə çıxıb düşürdülər.* S.Rəhman. **Danışıq kürsüsü** – bax **xitabət kürsüsü**. [Məhəmmədcəfər] *danışıq kürsüsünə çıxanda əlinin içi ilə başını tez-tez dala darıyardı.* Qantəmir. **Xitabət kürsüsü** – bax **kürsü** 2-ci mənada. *Burda nə səhnə vardır, nə xitabət kürsüsü; Nə əl-qolunu ölçən; Bir natiqin gur səsi.* R.Rza. *Salmanov növbəarası iclası açıb ona söz verincə, Haşımov .. xitabət kürsüsünün arxasına keçdi və .. danışmağa başladı.* Ə.Əbülhəsən.

3. *məc.* Vəzifə, rütbə, mövqe mənasında. [Hikmət İsfəhani] *bir neçə dəfə məclis vəkili olmuş, baş vəzir kürsüsünü tutmuşdur.* M.İbrahimov.

4. Keçmişdə: qızınmaq üçün altına manqalda və ya çalada od qoyulub, üstünə iri yorğan salınan yastı stol. *Kürsü qurmaq. Kürsüyə girmək. Kürsüdə qızınmaq. – Yayda yük üstü ona yaylaq idi; Kürsülər altı ona qışlaq idi.* S.Ə.Şirvani. *..Qışın soyuğunda da adam istəyir girsin isti kürsüyə və yorğanı çəksin başına..* C.Məmmədquluzadə. *Evin ortasında qədim qayda ilə kürsü qurulub, Məşədi Ağabanı kürsüdə oturub, əlində qırmızı parçadan özünə köynək tikir.* M.Əliyev.

**KÜRT** *sif.* Quşların bala çıxarma zamanındakı halı, vəziyyəti. *Kürt ördək. Kürt qaz.* ☐ **Kürt düşmək (yatmaq)** – bala (cücə) çıxarmaq üçün yumurta üstündə oturmaq. *Ev sahibi gözlədi; Ana qaz kürt düşsün.* R.Rza. *Səttarın göyərçinləri yumurtaladılar, kürt düşüb bala çıxartdılar.* Ə.Məmmədxanlı.

◊ **Kürt toyuq** *məc.* – evdən xaricə çıxmayan, tənbəl adam haqqında. **Kürt toyuq kimi yerimək** – yanlarını basa-basa, ağır-ağır yerimək. *Kürt toyuq kimi yeriyən Aşıq Abbasın dalınca zurnaçı Əkbər sürünürdü.* Mir Cəlal.

**KÜRTLÜK** *is.* Kürt düşmüş və ya kürt yatan quşun halı, vəziyyəti.

**KÜRTÜK** *is. məh.* Yazda dərələrdə qalmış qar komaları.

**KÜRÜ** *is. zool.* 1. Balıqların, amfibiyaların, molyuskların və suda yaşayan başqa heyvanların artmaq üçün tökdükləri dənşəkilli yumurtacıqlar. *Kürü tökmək. – ..Balığı tutub onların kürüsünü mayalayıb satırlar.* H.Zərdabi. // Balığın ərzaq məhsulu kimi işlənən dənşəkilli yumurtacıqlarından ibarət kütlə. *Qırmızı balıq kürüsü.*

2. Xırda doğranmış tərəvəz, göyərti və s.-dən ibarət yemək.

**KÜRÜLƏMƏ** "Kürüləmək"dən *f.is.*

**KÜRÜLƏMƏK** *f.* Kürü tökmək. *Balıqlar kürülədi.*

**KÜRÜLÜ** *sif.* Kürüsü olan. *Kürülü balıq.*

**KÜRÜMƏ** "Kürümək"dən *f.is.*

**KÜRÜMƏK** *f.* 1. Kürəklə təmizləmək, götürmək; kürəklə götürüb atmaq. *Qarı kürümək. Tövləni kürümək. Peyini kürümək. –* [Qumru] *dəhlizdən ötəndə xırıltı səsi eşitdi. Elə bil damda qar kürüyürdülər.* Mir Cəlal.

2. *məc.* Rədd etmək, qovmaq, uzaqlaşdırmaq. *O, yer üzündən silmək, yaxud heç olmazsa, bu rayondan kürüyüb yerinə keçmək istədiyi bu adamı belə görəndə təəccüb edir.* S.Rəhimov.

**KÜRÜNMƏ** "Kürünmək"dən *f.is.*

**KÜRÜNMƏK** 1. *məch.* Kürəklə təmizlənmək, kürüyüb atılmaq. *Küçənin qarı kürünüb. Tövlə küründü.*

2. *qayıd. dan.* Çıxıb getmək, rədd olub getmək. *Dur, buradan kürün.*

**KÜRÜNTÜ** *is.* Kürünüb yığılmış şeylər topası.

**KÜRÜTDÜRMƏ** "Kürütdürmək"dən *f. is*

**KÜRÜTDÜRMƏK** *icb.* Kürək və s. vasitəsilə təmizlətmək, kürüyüb atdırmaq. *Həyəti kürütdürmək. Peyini kürütdürmək.*

**KÜRÜTMƏ** "Kürütmək"dən *f.is.*

**KÜRÜTMƏK** bax **kürütdürmək.** *Xırmanı kürütmək.*

**KÜRÜTÖKMƏ** *is. xüs.* Balıqların kürütökmə dövrü və prosesi.

**KÜSDÜM, KÜSDÜMAĞACI** *is. bot.* Paxlalılar fəsiləsindən xırda ləlәkvari yarpaqlı ağac.

**KÜSDÜMGÜLÜ** *is. bot.* Küsdümağacının gülü.

**KÜSDÜMOTUKİMİLƏR** *cəm bot.* Küsdümotu və bəzi başqa paxlalı bitkilərin daxil olduğu bitki yarımfəsiləsinin adı.

**KÜSDÜRMƏ** "Küsdürmək"dən *f.is.*

**KÜSDÜRMƏK** *t-li.* Küsməsinə, inciməsinə səbəb olmaq; incitmək, ürəyinə toxunmaq, qəlbini qırmaq. *Dostunu özündən küsdürdü. – Rəqibdən kam al indi; Dərdin yada sal indi; Küsdürübsən yarını; Evdə yalqız qal indi.* (Bayatı). *Söylədi: – Camaat, küsdürdük sizi; Gərəkdir qalmaya inciklik izi.* H.K.Sanılı.

**KÜSƏN** b a x **küsəyən.** *Küsən payını artırar.* (Məsəl).

**KÜSƏNMƏ** "Küsənmək"dən *f.is.*

**KÜSƏNMƏK** *f.* 1. Ummaq, gileylənmək, giley-güzar etmək, küsən kimi olmaq. *Dost dostdan küsənər. – Nə üçün hamı mənə düşmən gözü ilə baxır, yoldaş leytenant, mənim günahım nədir?.. – deyə, Vəli küsənən* (f. sif.) *bir dost ədası ilə xəbər aldı.* M.Hüseyn.

2. Qibtə etmək, həsrətini çəkmək. *Yaxşı geyimə küsənmək. – Ataların misalıdır: keçən günə gün çatmaz; Ol səbəbdən küsənirəm əzəlki çağlara mən.* Molla Cümə. *..Qız da, oğlan da Nəcibənin yar-yaraşığına küsənir.* Mir Cəlal.

3. Qürrələnmək, arxayın olmaq, bel bağlamaq. *Varlılığa küsənən yoxsulluğa tez düşər.* (Ata. sözü).

**KÜSƏYƏN** *sif.* Tez küsən, hər şeydən inciyən, küsən; dəymədüşər. *Küsəyən qız. Küsəyən uşaq. –* [Mehriban xanım] *gah şıltaq bir qız, gah ceyranbaxışlı bir gəlin, sonra da indiki kimi küsəyən bir uşağa bənzər qarı şəklində dayanıb dururdu.* S.Rəhimov. [Misir] *ağızdan pərtov, küsəyən idi, söz saxlaya bilməzdi.* Ə.Vəliyev. // Obrazlı təşbehlərdə. *Bu yerlərdə nə istəsən taparsan. Yumşaq torpağa qanad sərən yemliyi, qazayağını, .. kölgə və sərinlik sevən çiyələyini, küsəyən bənövşənimi deyim?!* Mir Cəlal. // İs. mənasında. *Küsəyənin payını yeyərlər.* (Ata. sözü).

**KÜSƏYƏNLİK** *is.* Küsəyən adamın xasiyyəti.

**KÜSKÜ** b a x **küsü.**

**KÜSKÜN** 1. *sif.* Küsmüş, incik, incimiş, narazı. *Özünə yoldaşın görüb üskün; Bəzi olmuş həyatına küskün.* A.Səhhət. *Yenə bilməm nədir bu küskün hal? Daima həmdəmin düşüncə, xəyal.* H.Cavid. *Qız, bu küskün könlümü; Bircə sənsən güldürən.* Ə.Cavad.

2. *bot.* b a x **küsdümağacı.**

**küskün-küskün** *zərf* Küsmüş halda, narazı halda, incik-incik (adətən poetik təşbehlərdə işlənir). *Ay baxar küskün-küskün..* Ə.Cavad. *Sən baxarkən mənə bəzən elə küskün-küskün; Oldu can mülkü pərişan deməyim, bəs nə deyim?* S.Rüstəm.

**KÜSKÜNCƏSİNƏ** *zərf* Küsmüş halda, küskün tərzdə, narazı halda, incimiş kimi, incikcəsinə. *Küsküncəsinə cavab vermək.*

**KÜSKÜNLƏŞMƏ** "Küskünləşmək"dən *f.is.*

**KÜSKÜNLƏŞMƏK** *f.* Ruhdan düşmək, bədbinləşmək; narazı olmaq, incimək. *Səməd bəlkə də küskünləşib başladığı işdən soyuyar.* İ.Hüseynov.

**KÜSKÜNLÜK** *is.* Küsülülük, küsü saxlama, küsmə; inciklik, narazılıq. *Atası ilə anası arasında olan küskünlük, ailə həyatında olan uyğunsuzluq onda acı təsirlər oyadırdı.* A.Şaiq. *Dedi: – Az-az görünməyim küskünlükdən nişanədir; Dedim: – Bir az açıq danış, bu sözünün sirri nədir?* S.Vurğun. *Lakin gecə keçdiyini görərkən* [Sürəyya] *babasına qarşı bir küskünlük duyaraq kövrəldi və səssizcə ağlamağa başladı.* Ə.Məmmədxanlı.

**KÜSMƏ** "Küsmək"dən *f.is.*

**KÜSMƏK** *f.* 1. Hər hansı bir səbəbə görə birindən (adətən öz yaxın adamından) incimək, onunla danışmamaq, onu dindirməmək. *Yoldaşından küsmək. Qonşudan küsmək. –* [Kərbəlayı İsmayıl Zeynəbə:] *..Axırı, heç olmasa, götürüb naçərnikə yazaram ki, filan arvad ərindən küsüb.* C.Məmmədquluzadə. // Ümumiyyətlə, incimək, qəlbi sınmaq, xətri qalmaq. *Mehribanlıq görməyib bir məhliqadən küsmüşəm; Gündə yüz al eyləyən qəlbiqəradən küsmüşəm.* M.P.Vaqif. *Bizim bu sözlərimiz bir çox adamların xoşuna gəlmirdi. O adamlar bizdən küsürdülər..* Ü.Hacıbəyov. [Sultan:] *Küsərsən, qulağından çəkib qaytararam və deyərəm: – Dur burada, böyüyün sözünə baxmayan böyürə-böyürə qalar.* İ.Hüseynov.

2. *məc.* Bədbinləşmək, bədbinliyə qapılmaq. *Həyatdan küsmək. Dünyadan küsmək.*

**KÜSTAX** *sif.* [*fars.*] *klas.* Abır-hörmət bilməyən, özünü tərbiyəsizcə aparan; ədəbsiz, tərbiyəsiz, sırtıq, həyasız.

**KÜSTAXLIQ** *is. klas.* Ədəbsizlik, tərbiyəsizlik; ədəbsiz, tərbiyəsiz hərəkət. [Müəllim:] *Bağışlayın, İskəndər bəy, hərçənd bəndənin tərəfindən küstaxlıqdır sizə nəsihət eləmək, amma uşaq tayfasına o cür sözləri deməyiniz bir az bicadır.* C.Məmmədquluzadə. *Xüsusən yaşlı və böyük şairlərin iştirak etdiyi bu məclisdə bizim şeir oxumağımız küstaxlıqdır.* M.S.Ordubadi. // Sırtıqlıq, həyasızlıq.

**KÜSÜ** *is.* Bir-biri ilə danışmama halı; küsmə. *Küsülü qardaş, gəl yükü çataq, yenə küsümüz küsü.* (Məsəl). *Artıq yetər, bu nə umu, nə küsü; Sal yadına o qayğısız günləri.* Ə.Cavad. [Fərman Mələyə:] *Heç fikir eləmə, ömrü boyu cəhənnəmdə yanmaqdansa, ata-ananın bircə aylıq küsüsünə dözmək yaxşıdır.* M.İbrahimov. ◻ **Küsü saxlamaq (tutmaq, bağlamaq)** – bir-biri ilə danışmamaq, küsülü vəziyyəti davam etdirmək, dindirməmək. *Şirvana yol bağlaram; Dərd əlindən ağlaram. Yardan kağız almasam; Mən də küsü saxlaram.* (Bayatı).

**KÜSÜLÜ** *sif.* Küsmüş, incimiş, küsü saxlayan. *Küsülü* (z.) *qalmaq. – Gah küsülü olub, gahi barışıb; Bir saat keçməmiş ara qarışıb.* Q.Zakir. [Ağa Kərim:] *Mən bir cüzvi işdən ötrü* [Ağa Salmanla] *küsülüyəm.* M.F.Axundzadə. *Leyk gəl indi biz əyri oturaq, düz danışaq; Elə bil küsülü idik, gəl təzədən bir barışaq.* S.Ə.Şirvani. ◻ **Küsülü kimi** – sanki bir-birindən küsmüş, bir-birini dindirməyən adamlar kimi. *Dostlar bir-iki dəqiqə susub, küsülü kimi ayrı-ayrı səmtə baxdılar.* M.Hüseyn. *Küsülü kimi hərə öz aləminə dalmış, öz fikri ilə məşğuldu.* M.İbrahimov.

**KÜSÜLÜLÜK** *is.* Bir-biri ilə danışmama, bir-birindən küsmə vəziyyəti. *Küsülülüyümüz öz yolu ilə, dost, eşitmişəm otaq axtarırsan, gəl səni bir xeyirli yerə calayım.* Mir Cəlal. *Hə, nə var, küsülülüyün keçdimi?* Q.İlkin.

**KÜSÜŞMƏ** "Küsüşmək"dən *f.is.*

**KÜSÜŞMƏK** *qarş.* Bir-birindən küsmək. *Xatırında varmı, hərdən küsüşüb; Deyərdin: – Danışma, dindirmə məni!* R.Rza.

**KÜŞ** *is.* İti qısqırtmaq üçün çıxarılan səs. (*İskəndər qapıya tərəf gedib*)*: küş, küş, küş; xa... xa... xa...; küş, küş, küş... iti muşqurur.* C.Məmmədquluzadə.

**KÜŞDƏRƏ** *is. məh.* Ağacın içini ovub çıxarmaq üçün alət.

**KÜŞDƏRƏLƏMƏ** *f.is.* "Küşdərələmək"-dən *f. məh.*

**KÜŞDƏRƏLƏMƏK** Ağacın içini ovub çıxarmaq.

**KÜŞKÜRMƏK** b a x **küşkürtmək.** *Axırda da görürük ki, əcnəbilərin uşaqları məktəblərdə oxuyanda, bizimkilər küçələrdə iti küşkürürlər dərvişlərin üstünə.* C.Məmmədquluzadə.

**KÜŞKÜRTMƏ** "Küşkürtmək"dən *f.is.*

**KÜŞKÜRTMƏK** *f.* İti bir başqasının üstünə saldırmaq; qısqırtmaq. [Nazlı:] *Vallah, dadaş, ağam gələndə deyəcəyəm ki, dadaşım iti küşkürdürdü adamların üstünə.* C.Məmmədquluzadə.

**KÜŞ-KÜŞ** *təql.* Uşağı yatırtmaq üçün çıxarılan səs. **Küş-küş etmək** – uşağı yatırtmaq üçün "küş-küş" deyə oxşamaq. *Ana körpəni küş-küş edib yatırtdı.*

**KÜŞTÜ** *is.* [*fars.*] 1. *köhn.* Güləşmə, qurşaq yapışma. *Qara pəhləvan gəlib ərəb pəhləvana əl verdi. Onda ara açıldı, küştü başlandı.* "Koroğlu". *Meydan sulandı, süpürüldü, küştü başlandı.* (Nağıl). ◻ **Küştü tutmaq** – güləşmək, qurşaq yapışmaq. *..Meydana pəhləvanlar çıxıb küştü tutarlar.* C.Məmmədquluzadə.

2. B a x **küşültü.**

**KÜŞÜLDƏMƏ** "Küşüldəmək"dən *f.is.*

**KÜŞÜLDƏMƏK** *f.* Küşültü səsi çıxarmaq. *Dalğalar küşüldəyərək özünü buruğun dəmir sütunlarına çırpıb geri qayıtdıqca, dörd yandan hücuma keçdikcə* [Hüseynağa] *ürəyində Sərdarovu söyürdü.* M.İbrahimov.

**KÜŞÜLTÜ** *is.* Gəlib-qayıdan dalğaların güclü hərəkətindən hasil olan səs.

**KÜT**[1] *sif.* 1. Kəsməyən, iti olmayan, kəsəri olmayan. *Küt bıçaq. Küt balta.* – [Qulu:] *Bu elə kütdür ki, heç yer də qazmaz.* S.S.Axundov. *Qurd .. dişlərilə onu küt kəlbətin kimi sıxıb qançır etmişdi.* M.Rzaquluzadə.

2. *məc.* Kütbeyin, gec başa düşən, zehinsiz, dərrakəsiz, fərasətsiz, qanmaz, qavrama

qabiliyyətindən məhrum. *Küt adam. – Yaman qonşu, küt oğul; Qov yanından, xətadır.* (Ata. sözü). *O küt münəqqidi bir salın başa; Ömründə bir dəfə qoy adam olsun!* M.Rahim. // İs. mənasında. *Kütün biridir.*

3. B a x **boğuq** 2-ci mənada. *Küt tüfəng səsi. – ..Ayaq üstündə çürümüş iri ağacın yıxılmasına bənzər küt bir xırıltı eşidildi.* B.Bayramov. *Küt bir güllə səsi eşidildi.* İ.Hüseynov.

4. *məc.* Kəskin olmayan, o qədər də hiss edilməyən (ağrı, sancı və s. haqqında). [Xan] *alnında küt bir sancı duydu, başı gicəldi.* M.Rzaquluzadə. [Bəhlul:] *Özümdən asılı olmayaraq, ürəyimdə küt bir ağrı hiss eləyirdim.* B.Bayramov.

5. *məc.* İfadəsiz, mənasız, heç bir şey ifadə etməyən. *Küt nəzər. – Hacının gözündə küt və vahimə ilə dolu bir ifadə hakim idi.* M.İbrahimov. *Bu küt baxışlı, yekəpər bir oğlan idi.* H.Seyidbəyli.

◊ **Küt bucaq** – həndəsədə: düz bucaqdan böyük bucaq.

**KÜT**[2] *is.* Təndirin divarından düşüb od və ya kül üstündə bişən yöndəmsiz çörək. *Kütləri təndirdən çıxarmaq. Kütün külünü təmizləmək. – İt haradan aldı iki kütü, birini yesin, birini də başının altına qoysun.* (Ata. sözü). □ **Küt getmək** – təndirin divarından qopub od və ya kül üstünə düşmək. *Çörəklər küt getdi.*

◊ **Küt getmək** *məc.* – Yorğunluqdan tez və bərk yatmaq, yuxulamaq. *Uşaqlar küt getdilər.*

**KÜTBAŞ** *sif.* Küt, ağılsız, gecqanan; kütbeyin. *Kütbaş adam.*

**KÜTBAŞLIQ** *is.* Kütlük, fəhmsizlik, anlaqsızlıq; kütbeyinlik.

**KÜTBEYİN** b a x **kütbaş.** *Kimisi avam olur; kütbeyin, cahil olur; Kimi əlli-ayaqlı; hay-haray, paxıl olur.* R.Rza.

**KÜTBEYİNLİK** b a x **kütbaşlıq.**

**KÜTBUCAQ(LI)** *sif. riyaz.* 90°-dən böyük olan bucaq.

**KÜTLƏ** *is.* [*ər.*] Mexanikanın əsas kəmiyyətlərindən biri – bir cisimdə olan maddənin miqdarını ölçən əsas kəmiyyət; cismin, ona təsir edən qüvvəyə nisbətlə inersiyalılığın ölçüsü.

2. *tex.* Formasız, xəmirvari qatı və ya yarımqatı maddə. *Yapışqan kütləsi. Yaşılımtıl qatı kütlə. Ağac kütləsi* (kağız hazırlamaq üçün yarımfabrikat). – *Nəmli qatışığa .. şam yağı əlavə edib, kütlə hazırlayırlar.* R.Əliyev.

3. Böyük parça, kom, yığın, qalaq. [Muzdur] *..kağız ..yüzlük dəstəsini kütləsilə əlinə aldı.* S.Qənizadə. *Faydalı qazıntıların bəziləri böyük kütlələr şəklində, bəziləri ayrı-ayrı damarlar, səpələnti və sairə şəkildə tapılır.* M.Qaşqay.

4. Əhalinin, xalqın böyük bir topluluğu; əhalinin, zəhmətkeşlərin geniş dairələri; camaat. *Kütlənin tələbi* (*iradəsi*). – [Almaz:] *Kütləyə əsaslanmayan hər bir təşəbbüs ölümə məhkumdur.* C.Cabbarlı. *Ey geniş kütlənin acısı, şərbəti; Alovlu sənəti!* M.Müşfiq. *Kütlədə qəbiristan sükutu davam edirdi.* H.Nəzərli. // Ümumiyyətlə, camaat, xalq, əhali, böyük izdiham. *Kütləyə müraciət etmək. – Musa kişi maraqla kütlənin içərisinə girmək istəyən Firidunu qarşıladı.* M.İbrahimov. // Müəyyən xüsusiyyətlərinə görə birləşən adamlar qrupu; zümrə. *Tələbə kütləsi. Ziyalı kütləsi. – Geniş oxucu kütləsi böyük satiriki "Molla Nəsrəddin" adı ilə tanımağa başladı.* M.İbrahimov. *Böyük bir yarımdairə halında toplaşmış iştirakçı və tamaşaçılar kütləsinin mərkəzində bir masa qoyulmuşdu.* M.Rzaquluzadə.

**KÜTLƏLİ** *sif.* Kütləsi olan; tutumlu.

**KÜTLƏNDİRİLMƏ** "Kütləndirilmək"dən *f.is.*

**KÜTLƏNDİRİLMƏK** b a x **kütləşdirilmək.**

**KÜTLƏNDİRMƏ** "Kütləndirmək"dən *f.is.*

**KÜTLƏNDİRMƏK** b a x **kütləşdirmək.**

**KÜTLƏNMƏ** "Kütlənmək"dən *f.is.*

**KÜTLƏNMƏK** b a x **kütləşmək.**

**KÜTLƏŞDİRİLMƏ** "Kütləşdirilmək"dən *f.is.*

**KÜTLƏŞDİRİLMƏK** *məch.* 1. Küt hala salınmaq, kəsəri azaldılmaq; korşaldılmaq.

2. *məc.* Həssaslığı, qavrama qabiliyyəti azaldılmaq.

**KÜTLƏŞDİRMƏ** "Kütləşdirmək"dən *f.is.*

**KÜTLƏŞDİRMƏK** *f.* 1. Küt hala salmaq, kəsməz hala salmaq, kəsərini azaltmaq. *Bıçağı kütləşdirmək. Qayçını kütləşdirmək. – Dostlar! Kütləşdirməyək döyüş yarağını.* S.Rüstəm.

2. *məc.* Həssaslığını, qavrama qabiliyyətini, dərrakəsini azaltmaq, zəiflətmək; küt eləmək. *Beynini kütləşdirmək.* – [İngilislər] *kütlənin siyasi şüurunu kütləşdirməyə səy edərək ..mövhumat və bidətləri canlandırırdılar.* M.S.Ordubadi.

**KÜTLƏŞMƏ** "Kütləşmək"dən *f.is.*

**KÜTLƏŞMƏK** *f.* 1. Küt olmaq, kəsməz hala gəlmək, kəsəri azalmaq; korşalmaq. *Balta kütləşib. Bıçaq kütləşib – Baxma rəfiqə, qohum, qardaşa; Kütləsib, ülgüclərini çək daşa!* Ə.Nəzmi. *Neçə vaxtdı ki, Gövhər qiyməkeşi işlətmirdi .. qiyməkeş yaman kütləşmişdi.* H.Seyidbəyli.

2. *məc.* Həssaslığını itirmək, qavramaq qabiliyyətini, dərrakəsini itirmək. *Hafizəsi kütləşmək. – Nəhayət, yorulur, kütləşir başı; Dönüb kölgələnir məyus baxışı.* S.Vurğun. // Keyimək, keyləşmək. *Soyuqda dayanmaqdan kütləşmiş Ələmdar balkonun qabağına yeriyib, əlini qulağına gətirdi..* S.Rəhimov.

3. *məc.* Azalmaq, zəifləmək, hissedilməz hala gəlmək. *Getdikcə "alo, alo" səsləri çoxalır, Mehribanın ürəyindəki ağrı kütləşirdi.* H.Seyidbəyli.

**KÜTLƏVİ** *sif.* [*ər.*] 1. Geniş xalq kütləsinin, yaxud çoxlu adamın iştirakı ilə olan. *Kütləvi fəhlə hərəkatı. Sülh tərəfdarlarının kütləvi hərəkatı.* // Kütlənin iştirakı ilə olan, çox adam tərəfindən görülən. *Kütləvi səhnə. Kütləvi gəzinti. – İndi böyük və geniş foyedə ağır və yeknəsəq addımlarla kütləvi bir vals oynanırdı.* S.Hüseyn. *Slavyanlar İtaliya faşistlərindən intiqam almaq üçün kütləvi surətdə partizan dəstələrinə qaçırdılar.* S.Vəliyev. // Tək-tək adam tərəfindən deyil, bir çoxları tərəfindən edilən, göstərilən; kütləyə xas olan.

2. Kütlə üçün, çox, külli miqdarda, geniş miqyasda. *Kitab kütləvi tirajla buraxılmışdır.*

3. Geniş kütlə üçün görülən, xalq üçün edilən. *Keçən gün seçkiqabağı məni seçicilər arasında kütləvi iş aparmaq üçün Xıdırlıya göndərdilər.* S.Rəhman. // Geniş kütlə üçün, çoxlu adam üçün olan. *Kütləvi kitabxana. Kütləvi nəğmələr.*

**KÜTLƏVİLƏŞDİRİLMƏ** "Kütləviləşdirilmək"dən *f.is.*

**KÜTLƏVİLƏŞDİRİLMƏK** *məch.* Kütləvi xarakter verilmək, bütün kütləyə aid edilmək; populyarlaşdırılmaq.

**KÜTLƏVİLƏŞDİRMƏ** "Kütləviləşdirmək"dən *f.is.*

**KÜTLƏVİLƏŞDİRMƏK** *icb.* Kütləvi xarakter vermək, bütün kütləyə aid etmək, kütləvi etmək; populyarlaşdırmaq.

**KÜTLƏVİLƏŞMƏ** "Kütləviləşmək"dən *f.is.*

**KÜTLƏVİLƏŞMƏK** *f.* Kütləvi mahiyyət almaq, bütün kütləyə aid olmaq, kütləvi olmaq; populyarlaşmaq.

**KÜTLƏVİLİK** *is.* Kütləvi mahiyyət daşıma, kütləvi olma, bütün kütləyə aid olma; populyarlıq. *Ədəbiyyatın kütləviliyi. Maarifin kütləviliyi.*

**KÜTLÜK** *is.* 1. Küt şeyin hal və keyfiyyəti. *Bıçağın kütlüyü. Qayçı kütlükdən kəsmir.*

2. *məc.* Həssaslığın, qavrama və idrak qabiliyyətinin olmadığı hal. *Beyninin kütlüyündən dərs başına girmir.* // *məc.* Bacarıqsızlıq, qabiliyyətsizlik, dərrakəsizlik, qanmazlıq. [Vəznəli kişi] *ona görə məyus idi ki, qubernator qatilin dünənə qədər kənddə gəzdiyini, bizim kütlüyümüzdən istifadə ilə aradan çıxdığını eşitsə, əlbəttə .. deməyəcək*(*di*). Mir Cəlal. *..Potaboy adamın fəaliyyətsizliyi, kütlüyü Səmədi dəhşətə gətirirdi.* İ.Hüseynov.

**KÜTTƏLƏMƏ** "Küttələmək"dən *f.is.*

**KÜTTƏLƏMƏK** *dan.* bax **kütləmək.** *Kağızları küttələmək.* – [Muzdur] *əli əsə-əsə yüzlükləri bir-birinin üstünə küttələyib öz kağızına bağladı.* S.Qənizadə.

**KÜTÜB** [*ər.* "kitab" söz. cəmi] *klas.* Kitablar. *Dəxi o qədər şüuru yoxdur anlasın ki, hüsni-xətt əlzəm şey deyil və daş basmaxanasında kütüb qələt basılır və girənbəha olur.* M.F.Axundzadə.

**KÜTÜBXANA** *klas.* bax **kitabxana.** *Mümkün olsaydı da yurdumdakı meyxanələri; Həp kütübxanə yapardım.* H.Cavid.

**KÜTÜBXANAÇI** *klas.* bax **kitabxanaçı.**

**KÜTÜM** *is. zool.* Çəkikimilər fəsiləsindən vətəgə balığı, ziyad balığı.

**KÜVET** *is.* [*fr.*] Metaldan və ya plastik materialdan düzbucaqlı qab.

**KÜY** *is.* 1. Qalmaqal, səs-küy; dalaşan, vuruşan, çaxnaşmaya düşən adamların çıxardığı səs. *Nə gurultu, nə küy, nə səs vardır; Bir neçə ruhsuz qəfəs vardır.* A.Səhhət. [Hacı

Mehdi:] *Səsiniz, küyünüz qonum-qonşunu az qalıb köçürtsün.* Ə.Haqverdiyev. *Körpüdə izdiham çox idi. Buranın özünə məxsus səs və küyü ilə bir gecikmiş paroxodu yola salırdılar.* T.Ş.Simurq. ☐ **Küy basmaq** – səs-küy düşmək, qarışıqlıq baş vermək. *Həyəti küy basdı. – Otağı küy basdı.* M.Hüseyn. **Küy düşmək** – səs-küy düşmək, həyəcan-təlaş düşmək, şayiə yayılmaq, həyəcanlı xəbər yayılmaq. *Səhər Səriyyə xəbər gətirdi ki, kəndə yaman küy düşüb.* İ.Əfəndiyev. **Küy salmaq** – səs-küy salmaq, qışqırıq qoparmaq, qalmaqal salmaq. **Küyə düşmək** – 1) bir şayiə, xəbər və s.-dən həyəcanlanmaq, çaxnaşmaya düşmək, əl-ayağa düşmək; 2) başqalarına baxaraq təsirə düşmək, onlar kimi hərəkət etmək. [Telli:] *Bəsdir küyə düşüb o qəndil ağaclarından əkdik.* Ə.Məmmədxanlı. **Küyə salmaq** – bir sözü, işi, xəbəri yaymaq, aləmə bildirmək. [Əşrəf bəy:] *Heç küyə salma, qoy gəlsin, görək nə xəbərdir.* N.Vəzirov. [Kəndli:] *..Belə xəbəri küyə salmaq yaxşı deyil..* Ə.Əbülhəsən.

2. Hay-küy altında gizlədilən fırıldaq, yalan. *Onun küyünə inanmayın. – Bu zaman heç birisi açılışıb o birisinin küyünün üstünü vurmadı.* S.Rəhimov.

3. *dilç.* Sədanın iştirakı olmadan ağız boşluğunda yaranan danışıq səsi (*səda* qarşılığı).

**KÜYÇÜ** *sif.* 1. Hay-küyçü, qara-qışqırıqçı, küy salan; bir işi, xəbəri şişirdən. *Küyçü uşaq.* – [Sirat:] [Veysi] *mən heç belə küyçü bilməzdim!* Ə.Əbülhəsən.

2. Gopçu, yalançı. [Xanlar] *Ovçu tayfası elə küyçü olur, – deyə, anasının boynunu qucaqladı.* S.Rəhimov.

**KÜYÇÜL** bax **küyçü**.

**KÜYÇÜLÜK** *is.* Küy salma, qara-qışqırıq salma, bir iş, hadisə və s.-ni həddindən artıq şişirtmə xasiyyəti. *Mən o kəndin küyçülüyünü çoxdan bilirəm.* Mir Cəlal.

**KÜYÇÜLLÜK** bax **küyçülük.**

**KÜY-KƏLƏKÇİ** *is.* Küy-kələk salan; qalmaqalçı, hay-küyçü, tez təşvişə düşən adam. [Sirat:] *Çimnaz xala, yaxşı ki Veys də bir-iki günə gedəcək, ona hələ bir şey deməyin! O bir az küy-kələkçidir.* Ə.Əbülhəsən.

**KÜY-QALMAQAL, KÜY-KƏLƏK** *is.* 1. Hay-küy, səs-küy, qalmaqal: qarışıqlıq, araqarışma. [Minbaşı:] *Hərgah mənim imtahanıma etibarın varsa, artıq küy-qalmaqal lazım deyil.* N.Vəzirov. *Küy-kələk, bağırtı hədə və söyüş səsləri ətrafa yayıldı.* P.Makulu. ☐ **Küy-qalmaqal (küy-kələk) salmaq** – səs-küy salmaq, hay-küy salmaq. [Heydər bəy:] *Gərək bir dörd verst aşağıda küy-qalmaqal salaq, qazaqlar tamam aşağı ensinlər.* M.F.Axundzadə.

2. **Küy-kələklə** şəklində *zərf* – hay-küylə, səs salaraq, həyəcan içində. *Küy-kələklə iş görmək. – Babacan küy-kələklə içəri girdi.* Ə.Əbülhəsən.

**KÜYLƏMƏ** "Küyləmək"dən *f.is.*

**KÜYLƏMƏK** *f.* Bir işi, xəbəri, hadisəni və s. həddindən artıq şişirtmək, küy salmaq. [Şeyda:] *Ay Mehralı dayı, o qədər də küyləmə. Mən nə böyük iş görmüşəm ki?* S.Rəhman.

**KÜYLƏŞMƏ** "Küyləşmək"dən *f.is.*

**KÜYLƏŞMƏK** *qarş.* Səs-küy salmaq, qara-qışqırıq qoparmaq, hay-küy salmaq (çoxları haqqında). [Rəşid:] *Ana! Bu camaat niyə küyləşir, yoxsa bizi öldürəcəklər?* Ə.Haqverdiyev.

**KÜYLÜ: küylü samit** *dilç.* – əmələ gəlməsində küyün üstünlük təşkil etdiyi samit.

**KÜYÜL** *is. məh.* Dəstə, toplu (balıq, həşərat və s. haqqında). *Arı küyülü.*

**KÜYÜLDƏMƏ** "Küyüldəmək"dən *f.is.*

**KÜYÜLDƏMƏK** *f.* Boğuq, küylü səs çıxarmaq. *Meşə küyüldəyir.*

**KÜYÜLDƏŞMƏ** "Küyüldəşmək"dən *f.is.*

**KÜYÜLDƏŞMƏK** bax **küyüldəmək.** *Küyüldəşir dağlar, meşələr, dərə; Dəyir birbirinə qapı, pəncərə.* H.K.Sanılı.

**KÜYÜLTÜ** *is.* Gurultu, səs, küy. *Avtomaşının küyültüsü.*

**KÜYÜLTÜLÜ** *sif.* Küyültülü, küyü olan. *Ətraf o qədər sakit idi ki, uzaqlardan gələn tramvayın küyültülü səsi aydın eşidilirdi.* M.Hüseyn.

**KÜZ¹** *is.* Quzu saxlamaq üçün ensiz, uzun alçaq tikili. *Küzü təmizləmək. Küzləri qaydaya salmaq. – Əhməd küzə girib iki-üç quzu və oğlağın leşini bayıra çıxartdı..* Ə.Vəliyev.

**KÜZ²** *is.* Əkin yerini hissələrə bölmək üçün cüt və ya kotanla açılan şırım. *Çəkilmiş küz yarıdan keçməmiş göy üzünü .. ağ buludlar alır, hava isə bozarırdı.* S.Rəhimov.

**KÜZGƏL** *is. məh.* Çiy kərpic qəlibi.

**KÜZLƏMƏ** "Küzləmək"dən *f.is.*

**KÜZLƏMƏK** *f.* Kotanla, cütlə əkin yerində şırım açmaq. *Yeri küzləmək.*

**KÜZLÜ** *sif.* Kotanla, cütlə şırım açılmış, küzü olan (b a x **küz**[2]). *Küzlü tarla.*

**KVADRÁNT** [*lat.*] *riyaz.* Dairənin dörddə bir hissəsi.

**KVADRAT** [*lat.*] 1. *riyaz.* Dörd tərəfi bərabər düzbucaq. // Kvadrat şəklində olan şey; çargül. *Kvadrat kərpic. – Qarovulçu, kvadrat şəkilli bir taxta ilə yeraltı daxmanın qapısını bağlayır.* M.İbrahimov.

2. *riyaz.* Ədədin öz-özünə hasili. *Kvadrat tənlik. Kvadrata yüksəltmək.*

3. Mətbəə işində: naborun, klişenin və s.-nin ölçüsünü müəyyən etmək üçün istifadə olunan ölçü vahidi. *Kvadrat 48 punkta bərabərdir.* // Naborda boş yerləri doldurmaq üçün xüsusi mətbəə materialı. ☐ **Kvadrat mötərizə** – [ ] şəklində olan mötərizə.

◊ **Kvadrat-yuva üsulu** *k.t.* – tarlaçılıqda mütərəqqi əkin üsullarından biri. [Sultan:] *Bu qırx hektarı kvadrat-yuva üsulu ilə əkəcəyik.* M.İbrahimov.

**KVADRATURA** [*lat.* quadratus-dan] Kvadrat vahidlərlə (metr və s. ilə) hesablanan sahənin ölçüsü. *Otağın* (*mənzilin*) *kvadraturası.*

◊ **Dairənin kvadraturası** *riyaz.* – müadil kvadrata çevrilmiş dairənin sahəsi.

**KVANT** [*lat.* quantum] Fizika və kimyada hər hansı bir enerjinin ən kiçik miqdarı. *İşıq enerjisinin kvantı.*

**KVARS** [*alm.*] 1. Kristallar, yaxud başdan-başa kristal kütlələr halında təsadüf edilən rəngsiz mineral-silisium oksidi. *Kvars süxurları. Kvars kristalları.*

2. *dan.* Təbabətdə tətbiq edilən kvars lampası ilə şüalandırma. ☐ **Kvars lampası** – ultrabənövşəyi şüalar almaq üçün kvarsdan düzəldilmiş və içinə civə buxarı doldurulmuş uzunsov, kiçik boru şəklində elektrik lampası (təbabətdə, kənd təsərrüfatında və s.-də tətbiq olunur).

**KVARSLI** *sif.* Tərkibində kvars olan, kvarsla qatışığı olan. *Kvarslı şüşə. Kvarslı qum.*

**KVÁRTA** [*lat.*] *mus.* Diatonik qammada dördüncü pillə. // Həmin pillə ilə birinci pillə arasındakı interval.

**KVARTÁL** [*alm.* əsli *lat.*] 1. İlin dörddə biri; üçaylıq, rüb. *Kvartal planı. İlin birinci kvartalı. İkinci kvartalın hesabatı.*

2. *köhn.* 1862-ci ilə qədər Rusiyada: şəhərin bir məhəlləsinin polis idarəsi, polis şöbəsi. ☐ **Kvartal nəzarətçisi** – çar Rusiyasında: məhəlləyə baxan polis məmuru. // Keçmişdə canlı dildə səhv olaraq "polis nəfəri, polis məmuru" mənasında da işlənmişdir. *Dolanır bazarı darğa, kvartal; Döyülür sifətlər, yolunur saqqal.* Q.Zakir. *Nə pristav, nə köməkçi, nə kvartal, nə qazaq; Hamısı qurd kimi soymaqlığa xalqı ki, qoçaq; Məsləhətçin eləyiblər neçə əşxası qaçaq.* S.Ə.Şirvani.

3. *xüs.* Meşənin, tarlanın, üzümlüyün və s.-nin kvadrat şəklində bölündüyü sahələrdən biri.

**KVARTÉT** [*ital.* əsli *lat.*] 1. Dörd musiqi aləti və ya dörd səs üçün yazılmış musiqi əsəri.

2. Müvafiq musiqi əsərlərini ifa etmək üçün dörd nəfərdən ibarət musiqiçi dəstəsi. *Vokal kvarteti. Simli kvartet. – İştirak edənlərin sayından asılı olaraq, hər bir belə ansamblın öz adı var: iki nəfər oxuduqda – duet, üç nəfər – terset və ya trio, dörd nəfər – kvartet və i.a.* Ə.Bədəlbəyli.

**KVAS** [*rus.*] Çörəkdən, undan və s.-dən hazırlanan turşməzə içki. *Kvas istehsalı. Çörək kvası. Soyuq kvas.*

**KVASÇI** *is.* Kvas hazırlayan, ya satan adam.

**KVİNTA** [*lat.* quinta] 1. *mus.* Diatonik qammada beşinci pillə. // Həmin pillə ilə birinci pillə arasındakı interval.

2. Bəzi musiqi alətlərində ən yüksək sim.

**KVİNTET** [*ital.* əsli *lat.*] *mus.* 1. Beş musiqi aləti və ya beş səs üçün yazılmış musiqi əsəri.

2. Müvafiq musiqi əsərlərini ifa etmək üçün beş nəfərdən ibarət musiqiçi dəstəsi.

**KVİT** [*fr.*] Baş-başa, heç-heçə. ☐ **Kvit olmaq** – hesablaşmaq, üzülüşmək; baş-başa, əl-ələ olmaq.

**KVORUM** *is.* [*lat.*] Yetərsay, yetərsəs.

**KVOTA** *is.* [*lat.*] Hissə, norma, pay.

# MÜNDƏRİCAT

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Kompyuter səhifələyicisi: *Rəvan Mürsəlov*

Korrektorlar: *Pərinaz Musaqızı*
*Fəridə Səmədova*

Yığılmağa verilmişdir 08.07.2005. Çapa imzalanmışdır 31.07.2006.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 49,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 172.

DÜST 5773-90, DÜST 4.482-87

CBS POLYGRAPHIC PRODUCTION
Tel/Fax: 447 75 04, Tel.: 447 75 05

Kitab "CBS-PP" MMC mətbəəsində çap olunmuşdur.
Bakı, Şərifzadə küçəsi, 3.